*Bu kitab "Azərbaycan dilinin izahlı lüğəti" I cild* (*Bakı, Azərbaycan Elmlər Akademiyası nəşriyyatı, 1966*), *II cild* (*Bakı, Elm, 1980*), *III cild* (*Bakı, Elm, 1983*) *və IV cild* (*Bakı, Elm, 1987*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*


Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü,
filologiya elmləri doktoru, professor
**Əliheydər Orucovun**
rəhbərliyi və ümumi redaktəsi ilə

Tərtibçilər:

**Əliheydər Orucov, Bəhruz Abdullayev, Nərgiz Rəhimzadə**

Nəşrə hazırlayanı, təkmilləşdirəni və redaktoru:

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü
filologiya elmləri doktoru, professor
**Ağamusa Axundov**



**494.36131-dc21**
**AZE**
**Azərbaycan dilinin izahlı lüğəti.** Dörd cilddə. IV cild. Bakı, "Şərq-Qərb", 2006, 712 səh.

**ISBN10 9952-34-026-5**
**ISBN13 978-9952-34-026-6**

# Ss

**S** Azərbaycan əlifbasının iyirmi beşinci hərfi. B a x **se**.

**SAAM(LAR)** *is.* Kola yarımadasında, habelə Norveçin, Finlandiyanın və İsveçin şimalında yaşayan uqrofin dil qrupuna daxil olan xalq.

**SAAT** *is.* [*ər.*] 1. Gecə-gündüzün iyirmi dörddə birini təşkil edən və 60 dəqiqədən ibarət olan vaxt ölçüsü vahidi. // Saat ölçüsü vahidi. *İki saat işləmək. Üç saat gözləmək. Təyyarə iki saat gecikir. – Bir saat sonra alaçığımıza köçdük.* A.Şaiq. [Şahmar Şahpəriyə:] *Gündə kitabxananı cəmi bir saat açıq saxlamırsan.* B.Bayramov. ☐ **Bu saat** – indi, indicə. [Kazım:] *Bu saat başını salamat saxlamaq istəyirsənsə, başını aşağı sal, kəsbkarlığına qurşan..* Çəmənzəminli. *Elə bil bu saat bütün xarici aləm yalnız sədrdən asılı idi.* İ.Əfəndiyev. **Haman saat** – b a x **o saat**. *Haman saat işə başladı.* **O saat** – tez, əlüstü, dərhal. *Əgər mən biləm ki, qardaşım casusdur, o saat onu yaxalayıb, verərəm hərbi tribunala*. H.Nəzərli.

2. Günortadan, yaxud tən gecə yarıdan hesablanan 60 dəqiqəlik vaxt ölçüsü. [Mərcan bəy:] *Aha, saat neçədir, o vaxta bir saat qalıbdır, zərər yoxdur, qurtardım Minnətin üzündən, qurtardım!* Ü.Hacıbəyov. *Saat üçdü... Kazım işdən qayıtmış; Vücudunu qaplamışdı yorğunluq*. M.Müşfiq.

3. Gecə-gündüz müddətində vaxtı təyin etmək üçün alət, cihaz. *Divar saatı. Cib saatı. Qol saatı. – Usta Zeynal Mirzə Səfərin oğluna xeyir-dua verib, yaxşı yol ilə müvəffəqiyyət diləyib bir qızıl saat da verdi.* Ə.Haqverdiyev. *..Əzizin gözləri saatın yanından asılmış böyük bir şəklə ilişdi.* S.Rəhman.

4. Tənəffüslə birlikdə dərsə, mühazirəyə sərf olunan 60 dəqiqəlik müddət. *Akademik saat* (*texnikumlarda və ali məktəblərdə 50 dəqiqə davam edən vaxt, müddət*). *Dərs saatı* (*ümumtəhsil məktəblərində 45 dəqiqə davam edən məşğələ müddəti*). *Dərs proqramını saatlara bölmək.* // Pedaqoji məşğələ, mühazirə. *Saatlarımı yazdınmı? Xəstə müəllimin saatlarını kimə verdilər?*

5. Vaxt, çağ, an, zaman. *Axşam saatlarında. – İraq olsun yaman gözdən, nə xoş saətdir ol saət; Ki, məşuqilə aşiq eyləyib nazişitab oynar.* Füzuli. [Cavadın] *dərələrdən quzuqulağı yığıb yediyi saatlar gözləri qabağında canlandı*. Ə.Vəliyev.

6. B a x **saatlıq**. *Buradan oraya neçə saat yoldur? – Bakıdan buraya dörd saata gəlmişdik*. M.Hüseyn.

◊ **Bir saatın içində** – dərhal, o saat, gecikmədən. *Bir saatın içində ağa ikən qul oldum*. B.Vahabzadə. **Saatdan-saata** – b a x **saatbasaat**. *Bina saatdan-saata ucalırdı. – Üçüncü quyu ətrafında görülən işlər gündən-günə deyil, saatdan-saata artır.* Y.Əzimzadə.

**SAATBASAAT** *zərf* Vaxt keçdikcə, saatdan-saata, durmadan artaraq. *Yağış saatbasaat güclənir. Camaatın sayı saatbasaat artır. – Səri-kuyin məhşər, qəddin qiyamət; Qiyamət edərsən saətbəsaət*. Q.Zakir.

**SAATQABI** *is. köhn.* Saat qoymaq üçün üstü zərli saplarla, güləbətinlə naxışlanmış kisəcik. *Üstünə güləbətin çəkilmiş daraqqabı, saatqabı da nəzəri cəlb edirdi.* H.Sarabski.

**SAATLARCA** b a x **saatlarla**. *Saatlarca davam edən qarışıq fikirlər İbrahim xanı məşğul etdi*. Çəmənzəminli. [Musanın nəvəsi] *saatlarca aynanın qabağında öz vücuduna tamaşa edirdi*. Qantəmir.

**SAATLARLA** *zərf* Bir neçə saat, uzun müddət. *Yağış saatlarla davam etdi. Saatlarla oxumaq*. – [Kamal] *saatlarla gözünü qarlı dağların təpəsinə zilləyib, onları seyr etməkdən doymazdı.* M.Rzaquluzadə. *Səməd yeməyib-içməyib saatlarla Muradın mahnılarını dinləməyə hazır idi.* İ.Hüseynov.

**SAATLIQ** Saylarla yanaşı işlənib, bir işin neçə saata görüldüyü, görülə biləcəyi, yaxud davam etdiyi müddəti bildirir. *8 saatlıq iş günü. – Yar, arxanda bir dağam; Yatmamışam, oyağam; Dola qolun boynuma; Bir saatlıq qonağam*. (Bayatı). [Qəhrəman:] *Günorta zamanı olardı. Şəhəri yarım saatlıq bir sükut bürüdü*. H.Nəzərli.

◊ **Bir saatlığa** – müvəqqəti olaraq, hələlik, bir anlığa. *Bir saatlığa belə tutaq ki, ... hərəmxana işləri tüpürməyə layiq bir şeydir.* C.Məmmədquluzadə.

**SAATSAZ** *is.* [*ər.* saət və *fars.* ...saz] Saat təmir edən usta. *Bununla belə onun bircə*

*nəfər həqiqi dostu var idi – saatsaz usta Zeynal.* Ə.Haqverdiyev. *Bakıda ümumiyyətlə peşəkarlar: xalçaçı, zərgər, papaqçı, saatsaz, minasaz, dəllək, boyaqçı və sair çox olardı.* H.Sarabski.

**SAATSAZLIQ** *is.* Saatsazın sənəti, peşəsi. [Zeynal:] *Mən də ki saatsazlığımla səndən çox qazanmıram*. Ə.Haqverdiyev.

**SABAH** *is.* [*ər.*] 1. Günün başlanğıcı, günün ilk saatları; səhər, sübh. *Sabah erkən. Sabah yeli. Sabah ertə. Sabah günəşi. – Axşam, sabah, çeşmə, sənin başında; Bilirsənmi necə canlar dolanır?* Aşıq Ələsgər. *Ol qəmli gecə sabah olunca; Rahət yuxu yatdı bir doyunca.* A.Səhhət. *Mən də meşə cığırı ilə .. adət etdiyim sabah gəzməyindən evə hərəkət edirdim.* A.Divanbəyoğlu. □ **Sabah açılmaq (olmaq)** – səhər açılmaq, gündüz başlamaq. *Bəli, sabah açıldı, üstünüzə çoxlu xoş sabahlar açılsın*. "Abbas və Gülgəz". *Sabah olan kimi Məlikməmməd almaları yığıb, bir məcməyiyə qoydu və üstünə də örtük çəkib, atasına apardı.* Çəmənzəminli. **Sabaha qədər (kimi)** – işıqlanana qədər, səhər açılana kimi, səhərədək. *İşçilər bir çox danışıqdan sonra, sabahadək işləməyib cavab gözləməyi qərara aldılar*. H.Nəzərli. *Həmin gecə, demək olar ki, sabaha kimi Həmzənin zirzəmilərində, anbarlarında işıq yandı*. Ə.Əbülhəsən. **Sabahın(ız) xeyir!** – səhərçağı bir-birilə görüşdükdə söylənilən ifadə. **Gecəni sabah eləmək (etmək)** – sabaha qədər bütün gecəni oyaq qalmaq, yatmamaq.

2. Bu gündən sonra gələcək gün, ertəsi gün. *Bu günün işini sabaha qoyma*. (Ata. sözü). *Sabahı günü Cəlil ağa gözlərini açanda özünü bir qeyri aləmdə, bir qeyri mühitdə gördü.* İ.Musabəyov. [Murad:] *Deyirlər sabah yaxşı film göstəriləcək.* İ.Əfəndiyev.

3. *məc.* Gələcək mənasında. [Əmiraslan baba uşaqlara:] *..Onu demək istəyirəm ki, sabah sizin, gələcək sizindir!* S.Rəhimov. *Yox, yox, ayrı deyildir gözəl sabahımızdan; Əziz xatirələrlə bizdən ayrılan illər*. S.Rüstəm. *Bugünkü əməliylə; O, sabahı yaradır.* B.Vahabzadə.

**SABAH-BİRİGÜN** *zərf* Yaxın gələcəkdə, yaxın günlərdə, yaxınlarda.

**SABAHDAN** *zərf* 1. Sabah başlanan kimi, günün başlanğıcından, günün ilk saatlarından; səhərdən. [Mahmud:] *Sabahdan balta çalıram, bir qıxmıq da qopara bilmirəm*. Ə.Haqverdiyev.

2. Ertəsi gündən. *Sabahdan işə başlayırıq*. – [Əsgər:] *Vallah, sabahdan arşınmal satan olacağam*. Ü.Hacıbəyov. *Sabahdan o uşaqlar qarının ümidinə qalacaq, dərslərinə baxan olmayacaq*. M.Hüseyn.

**SABAHGÜLÜ** *is. bot.* Üzərinə günəş işığı düşdükdə açılan, kölgədə isə gülləri bükülən birillik gül bitkisi.

**SABAHKI** 1. *zərf* Ertəsi günü, sabahısı. *Sabahkı günü bir kəllə qənd alıb məni bağışladı və günahımdan keçdi.* C.Məmmədquluzadə. *Sabahkı gün tarçı Əsədin cənazəsi arabaya qoyulub, həmişəki adət üzrə "ərrəhman" oxuna-oxuna qəbiristana aparıldı.* B.Talıblı.

2. *sif.* Sabah olacaq, ertəsi gün olacaq, sabaha təyin olunmuş. *Sabahkı görüş. Sabahkı bayram. – Sabahkı vuruşma qəti və mühümdür.* H.Nəzərli. *Sabahkı tətilin bir məqsədi var; Gərək buraxılsın qaladan Xanlar!* S.Vurğun.

**SABAHLIQ** *is.* və *sif.* 1. Sabah görüləcək, sabah olacaq. *Ancaq sabahlıq işim qalıb*.

2. Sabaha bəs edəcək, sabahkı günə yetəcək. *Sabahlıq çörəyimiz vardır*.

**SABAH-SABAH** *zərf* Səhər tezdən, sübh ertədən, gün təzəcə başlayanda. *Sabah-sabah işini görüb qurtarmaq. – Nəhayət, son verildi yatmadığım gecəyə; Sabah-sabah bir mayis rəqs edərkən odamda*. M.Müşfiq.

◊ **Sabah-sabaha salmaq** – çox yubatmaq, ləngitmək, gecikdirmək, bu gün-sabaha salmaq. [Piri:] *Bir bu işi uzadıb, sabah-sabaha salan adamı verəydilər mənə..* M.Süleymanov.

**SABİQ** *sif.* [*ər.*] Əvvəldə olmuş, keçmişdə olmuş; keçmiş, köhnə, əvvəlki. *Zeynal ötəyəbəriyə müraciət edib sabiq xidmətini geri istəyirdisə də, müvəffəq olmayırdı.* S.Hüseyn. *Sabiq tacir Ağa Qurbanı hamı tanıyırdı.* Ə.Haqverdiyev.

**SABİQƏN** *zərf* [*ər.*] *köhn.* Bundan əvvəl, keçmiş, qabaq. *Yox ikən sabiqən gediş-gəlişi; İndi bir başqa rəng alıbdır işi.* M.Ə.Sabir.

**SABİT** *sif.* [*ər.*] 1. Hərəkət etməyən, hərəkətsiz, daim bir qərarda duran (qalan), dəyiş-

məyən, tərpənməz; daimi. *Sabit cərəyan. Sabit temperatur. Sabit qüvvə.*

2. *məc.* Səbatlı, möhkəm; fikrinin, əqidəsinin üstündə möhkəm duran, fikrindən, əqidəsindən dönməyən. *Bircə Zeynal bəy toxtaq durub, əvvəlki layihəsində sabit idi...* Çəmənzəminli. ☐ **Sabit qalmaq** – bir şeyin üstündə möhkəm durmaq, fikrindən, əqidəsindən dönməmək. *Xülasə, şəhərdə hər bir şey tərəqqi tapmışdı, dəyişilmişdi, abad olmuşdu, bircə usta Ağabala qədimliyində sabit qalıb otuz il idi ki, bu qərar ilə məişət keçirirdi.* Çəmənzəminli.

◊ **Sabit olmaq** *köhn.* – sübut olunmaq, yəqin olmaq, sübuta yetmək. [Fərraşbaşı:] *Ağa Şahzadə soruşur ki, Hacı Qafurun bacısının varisliyi sizin yanınızda sabit oldumu?* M.F.Axundzadə.

**SABİTQƏDƏM** *sif.* [*ər.*] Sözünün, fikrinin, vədinin üstündə möhkəm duran, sözündən, vədindən dönməyən; səbatlı, möhkəm. *Zahid, ramazanda mənə bu tövbəni verdin; Get, başın üçün, tövbədə sabitqədəməm mən.* S.Ə.Şirvani. *Mən öz əhd-peymanımda möhkəm və sabitqədəməm.* M.F.Axundzadə. *Sabitqədəm olsaydı əgər yari-vəfadar; Aşiq dəxi qaçmazdı bəladan, dayanardı.* M.Ə.Sabir.

**SABİTLƏŞDİRİLMƏ** "Sabitləşdirilmək"dən *f.is.*

**SABİTLƏŞDİRİLMƏK** *məch.* Sabit (1-ci mənada) hala salınmaq.

**SABİTLƏŞDİRMƏ** "Sabitləşdirmək"dən *f.is.*

**SABİTLƏŞDİRMƏK** *t-li.* Sabit (1-ci mənada) hala salmaq.

**SABİTLƏŞMƏ** "Sabitləşmək"dən *f.is.*

**SABİTLƏŞMƏK** *f.* Sabit olmaq, sabit hala gəlmək.

**SABİTLİK** *is.* Sabit şeyin hal və vəziyyəti; daimilik, dəyişməzlik. *Qiymətlərin sabitliyi. Valyutanın sabitliyi.* – [Rüstəm bəy:] *Təbiət müvazinəti pozulduqda əbədi qanunun sabitliyi sarsılır.* Çəmənzəminli.

**SABOTÁJ** [*fr.* sabotage] Qəsdən işləməmək və ya işi pozmaq yolu ilə işə mane olma.

**SABOTAJÇI** *is.* Sabotaj edən, sabotajla məşğul olan adam.

**SABOTAJÇILIQ** b a x **sabotajlıq**.

**SABOTAJLIQ** *is.* Sabotaj hərəkəti, sabotaj.

**SABUN** *is.* Kirli və ya yağlı şeyləri və s.-ni yuyub təmizləmək üçün yağlardan və qələvi maddələrdən hazırlanan, suda tez əriyib köpüklənən bərk və ya yarımmaye kütlə. *Paltar sabunu. Əl-üz sabunu. Ətirli sabun. Hamam sabunu.* – [Səriyyə:] *Səhər tezdən ikimiz də eyni vaxtda qalxdıq. Məhrəba, sabun, diş fırçası götürüb suyun üstünə endik.* İ.Əfəndiyev.

◊ **Sabun köpüyünə (qovuğuna) dönmək** – heç olmaq, puç olmaq, yox olmaq. *..Keçən ilin ortalarından tutulmağa başlanılan plan yeni ildə sabun qovuğuna dönmüşdü.* "Kirpi".

**SABUNBİŞİRƏN** *is.* Sabunbişirmə mütəxəssisi, sabun istehsalatı fəhləsi; sabunçu.

**SABUNÇU** *is.* 1. *köhn.* Sabun bişirməklə məşğul olan adam.

2. Sabun istehsalı işçisi.

**SABUNÇULUQ** *is. köhn.* Sabunçunun işi, peşəsi.

**SABUNQABI** *is.* İçinə sabun qoymaq üçün qab, qutu; sabunluq.

**SABUNLAMA** "Sabunlamaq"dan *f.is.*

**SABUNLAMAQ** *f.* Sabun sürtmək, sabunla yumaq. *Əllərini sabunlamaq. Paltarları sabunlamaq. – Bədənimi kisələyib üstümə bir neçə dəfə isti su tökəndən sonra bu kişi* [camadar] *başladı başımı sabunlamağa.* C.Məmmədquluzadə.

**SABUNLANMA** "Sabunlanmaq"dan *f.is.*

**SABUNLANMAQ** *məch.* 1. Sabunlu suda yuyulmaq, sabunla yuyulmaq.

2. Sabun sürtülmək, sabun çəkilmək. [Ocaqverdi:] *Bəy, heç sizə əziyyət olmayacaq. Kəndir qayda ilə sabunlanıbdır.* Ə.Haqverdiyev.

**SABUNLU** *sif.* 1. Tərkibində sabun olan. *Sabunlu su.*

2. Sabuna bulaşmış, sabun sürtülmüş. *Sabunlu əl. Sabunlu paltar.*

**SABUNLUQ** *is. məh.* b a x **sabunqabı**.

**SABUNOTU** *is. bot.* Kökündə saponin olan zəhərli bitki.

**SABUNSUZ** *sif.* Sabunu olmayan, sabun sürtülməmiş. [Mahmud:] *Qarnım sabunsuz araba çarxı səsi verir.* Ə.Haqverdiyev.

**SAC** *is.* Üzərində lavaş, yuxa, bozlamac, qutab və s. bişirmək üçün ortası qalxıq, dairəşəkilli çuqun və ya dəmir lövhə. [Gülsüm]

*birtəhər itdən xilas olub, özünü çörək təndirinə soxdu və dəmir sacı başına çəkdi.* Çəmənzəminli. *Səmədin nəzərləri .. sacın, içində qurumuş xəmirdə barmaq izləri görünən teştin və oxlovun üzərində gəzdi.* İ.Hüseynov. // Sacda bişirilən. *Sac qovurması* (*saciçi*). – *Hamımız bərabər yağ, süd və yenicə bişmiş sac çörəyi ilə qarnımızı doydurduq.* H.Nəzərli. *Mənə dağ havası verin! Sac yuxası verin!* R.Rza.

**SACAYAQ, SACAYAĞI** *is.* Açıq havada xörək və s. bişirmək üçün üstünə qazan qoyulan üçayaqlı dəmir çənbər. *Təzə qalaylanmış mis qablar, şiş, maşa, sacayaq, qiyməkeş və sair ailə mətbəxində işlənməsi lazım olan hacətləri cehiz adı ilə atası qızına verəcəkdir.* R.Əfəndiyev. *Xədicə səhər yığdığı pencəri qazana doldurub sacayağının üstünə qoymuş, yamaqlı qədək döşlüyü ilə təzə qaladığı ocağı ətəkləyirdi.* Ə.Vəliyev.

**SACİÇİ** *is.* Sacın içində bişirilən ət qovurması. [Yüzbaşı:] *Ağa, qurbanın olum, qarnınızı şor-çörəklə doydurmayın, saciçi bu saat hazır olar! – deyirdi.* Çəmənzəminli. *Almurad babanın bişirdiyi bu saciçi mənə o vaxta qədər yemiş olduğum bişmişlərin hamısından ləzzətli gəldi.* İ.Əfəndiyev.

**SAÇ** *is.* İnsanın başında bitən tüklər. *Qara saç. Xurmayı saç.* – *Külək* [Dürrənin] *qumral saçını üz-gözünə çırpırdı.* S.Vəliyev. [Nərgiz] *anasının ona ilk dəfə saç hördüyünü xatırlayırdı.* B.Bayramov. // Hörük. [Koroğlu:] *Siyah saçlar dal gərdənə düzülü; Qara gözlər xumarlanıb süzülü.* “Koroğlu”.

◊ **Saç ağartmaq** – b a x **baş ağartmaq** (“**baş**”da). *Ömür çürütməsən, saç ağartmasan; Yaranmaz sənətkar, yaranmaz sənət!* Z.Xəlil. **Saçı ağartmaq** – yaşa dolmaq, qocalmaq. *Artıq saçları ağarıb, qırmızı paltar ona yaraşmır.* **Saçı dabanında (olmaq)** – uzun hörükləri olan qız (qadın) haqqında. [Yetər Kərbəlayıya:] *Özü də çox gözəldir ... uzunboylu, saçı dabanında, uçuq evin dirəyi bir qızdır..* Çəmənzəminli. **Saçına dən düşmək** – başı (saçı) ağarmağa başlamaq, tək-tək, seyrək ağ tüklər görünmək. *İllər ötdükcə saçlarıma dən düşdü.* – *Müsahibimin səliqə ilə vurulmuş saçlarına yenicə dən düşmüşdü.* Q.İlkin.

**SAÇAQ** *is.* 1. Bir şeyin (adətən pərdənin, paltarın və s.-nin) kənarları boyunca tikilən çox sıx, sallanan sap telləri. *Xalçanın saçaqlarını düzəltmək. Şalın saçaqları. Pərdəyə saçaq tikmək.* – *Libasın əlvandır, çarqat narıncı; Saçaqlar yaraşır qıraqlarından.* M.P.Vaqif. [Sona] *..başından sıyrılıb çiyninə düşən ağ torunun ipək saçaqları ilə oynayırdı.* Ə.Əbülhəsən.

2. *bot.* Bəzi bitkilərdə uzun nazik tellər. *Qarğıdalı saçağı.* – [Hurizadın] *..tükləri məzəli bir rəng alar – gah qarğıdalı saçağına, gah da kal qarpıza bənzər.* Çəmənzəminli. [Səməndərin] *gözünə ancaq söyüdün soyuq saçaqları göründü.* B.Bayramov.

3. *məc.* Şüa. *Günün saçaqları yayılır düzə; Çünki təslim olur gecə gündüzə.* S.Vurğun. *Günəşin enerji ilə dolu qızıl saçaqlarının təsiri altında yarpaqlarda bütün canlıların həyatının əsasını təşkil edən qidalar, üzvi maddələr hazırlanmağa başlayır.* M.Axundov.

**SAÇAQLAMA** “Saçaqlamaq”dan *f.is.*

**SAÇAQLAMAQ** *f.* 1. Saçaq etmək, saçaq salmaq.

2. Tel-tel etmək. *Kəkliyi bıçaqlaram; Tüklərin saçaqlaram; Vədə verib gəlməsən; Balıncı qucaqlaram.* (Bayatı).

**SAÇAQLANMA** “Saçaqlanmaq”dan *f.is.*

**SAÇAQLANMAQ** *f.* Saçaq-saçaq olmaq, saçaqlar şəklində sallanmaq. *Qışda bu atların tükləri bir qarışdan da artıq saçaqlanır, sonra da yapağı bir yapıncı kimi üstlərinə yapışardı.* S.Rəhimov. *Yaşıl otlar qol-budaq verib, saçaqlanaraq arxın üstünü elə örtmüşdü ki, oradan su axdığını ancaq arasıkəsilməz şırıltıdan bilmək olurdu.* M.İbrahimov.

**SAÇAQLI** *sif.* 1. Saçaqları olan, saçaq salınmış, saçaq qoyulmuş. *Saçaqlı xalı. Saçaqlı süfrə. Saçaqlı yaylıq. Saçaqlı pərdə.* – [Qadın] *başına nə qədər sığal vurdusa da, kirpi saçlarını yatırda bilmədi, əlindəki saçaqlı dəsmalı başına dolamalı oldu.* M.Hüseyn. *Nazlı əlində bağlama, başında saçaqlı şal yüyürüb gəlir.* Ə.Məmmədxanlı. ☐ **Saçaqlı konfet** – keçmişdə: saçaqlı kağıza bükülmüş konfet növü. *Teybə .. evə yolu düşəndə Bahadır üçün həmişə fındıq, qoz, saçaqlı konfet, iydə və bəzən xurma gətirərdi.* M.Hüseyn. [Çərçi] *bəzi vaxt saçaqlı konfet də gətirərdi.* S.Rəhimov.

2. Saçaq kimi sallanmış uzun tükləri olan. *Saçaqlı qoyun. Saçaqlı it.*

3. *bot.* Kökü saçaq şəklində (tel-tel) olan. *Saçaqlı köklər. – Eyvaz dayı da saçaqlı tütündən papiros çəkə-çəkə başlayırdı kolxozu tərifləməyə.* İ.Əfəndiyev.

**SAÇAQ-SAÇAQ** *zərf* Saçaqlardan ibarət, saçaq halında. *Sənəmin başı .. saçaq-saçaq sallanan sünbüllərin arasına əyilmişdi.* Ə.Əbülhəsən. *Qaranlıq əriyib sabah olacaq; Günəş doğacaq, qızıl telləri saçaq-saçaq.* R.Rza.

**SAÇAYIRAN** *is.* Keçmişdə: qadınların saçının tağ şəklində qalması üçün başa vurulan naxışlı sancaq. [Yengə xonçasında] *olar: sabun, duxi, odekolon, iynə, üskük, saçayıran, yelpazə.* R.Əfəndiyev.

**SAÇBAĞI** *is.* Saça, hörüyə bağlanan lent-şəkilli bağ. *Yarpaqtək əsən olsan; Saçbağın kəsən olsan; Əzrail mənə neylər; Başım üstə sən olsan.* (Bayatı).

**SAÇ-BİRÇƏK** *top.* Başda olan saçın, birçəyin hamısı.

◊ **Saç-birçək ağartmaq** – b a x **saç ağartmaq**. **Saç-birçək dalaşmaq (qoymamaq)** – b a x **saçyolmaya çıxmaq**. [Səttar bəy:] *Əlavə, Fatma xala ilə Çiçək xanım küçədə saç-birçək dalaşıblar.* N.Vəzirov. **Saçı-birçəyi ağarmaq** – 1) qocalmaq, ahıllaşmaq (qadın haqqında); 2) bir işə çox zəhmət qoymaq, çox əlləşmək. [Gülzada:] *Ondan xəbərim var ki, Səlbinin saç-birçəyi divanxana qapılarında ağarıb.* Ə.Vəliyev. **Saç-birçəyini yolmaq** – dəhşət içərisində olmaq, dərd-qəm içərisində olmaq, dərin mənəvi həyəcan və iztirab keçirmək. *Dərd əlindən solmuşam; Saç-birçəyim yolmuşam, Axır bu eşq odundan; Əriyib mum olmuşam.* (Bayatı).

**SAÇILMA** "Saçılmaq"dan *f.is.*

**SAÇILMAQ** *f.* Dağılmaq, yayılmaq, səpələnmək, ətrafı bürümək. *Göy səmti açıldıqca könüllər də açıldı; Dünya üzünə zövq, səfa endi, saçıldı.* A.Səhhət. *Güllərin ətri otların iyinə qarışıb ətrafa saçılmaqda idi.* T.Ş.Simurq. *Yamaclarda boynubükük bənövşələrin ətri saçılır, qönçələrə, düymələrə parlaq incilər düzülürdü.* M.Rzaquluzadə.

**SAÇQIRAN** *is.* Saçın qırılıb tökülməsinə səbəb olan xəstəlik; muryana.

**SAÇLAMA** "Saçlamaq"dan *f.is.*

**SAÇLAMAQ** *f.* Saçından tutub dartmaq. *Kərbəlayı Həsən yerindən sıçrayıb arvadı saçladı və baş-göz deməyib, hər yerinə yumruqdan döşədi.* Çəmənzəminli. *Şahpəri sözünün dalını gətirməmiş, qarı yaşına yaraşmayan bir cəldliklə yerindən oynayıb onu saçladı.* B.Bayramov.

**SAÇLANMA** "Saçlanmaq"dan *f.is.*

**SAÇLANMAQ** *f.* Başı saçla, tüklə örtülmək, saçı çıxmaq.

**SAÇLAŞMA** "Saçlaşmaq"dan *f.is.*

**SAÇLAŞMAQ** *qarş.* Bir-birinin saçından tutaraq dartmaq; dalaşmaq. [Asya:] [Gülsabah və Turac] *az qalıb ki, lap saçlaşsınlar.* C.Cabbarlı.

**SAÇLI** *sif.* Başında saçı olan. *Cavanların arasından çesuça kostyumla lak çəkmə geymiş saçlı, tökmərək bir oğlan çıxıb irəli gəldi.* Ə.Əbülhəsən.

**SAÇLI-BİRÇƏKLİ** *sif.* Gözəl uzun saçları olan. [Qızın anası:] *Bax, saçlı-birçəkli, boylu-buxunlu, ədəbli-ərkanlı, gözəl-göyçək qız bəsləmişəm.* H.Sarabski.

**SAÇLI-SAQQALLI** *sif.* Uzun saçı və saqqalı olan. *Şəkildə saçlı-saqqallı bir kişi təsvir olunmuşdu.*

**SAÇMA** 1. "Saçmaq"dan *f.is.*

2. B a x **qırma** 2-ci mənada. *Xəlil isə atdığı saçmanın gilizini çıxardıb üflədi.* M.Hüseyn. *Tək bir saçma* [quşun] *sol qanadının ucunu dəlib keçmiş, sümüyü sındırmamışdı.* M.Rzaquluzadə. *Məmmədxanla Yusifəli başqa şeylərlə, qızılquşla, ov tulası ilə, saçma, barıt və varlı uşaqlarına məxsus şeylərlə maraqlanırdılar.* P.Makulu.

3. Boş, yersiz, mənasız, rabitəsiz, məntiqsiz söz; hədyan. [Orxan:] *O məcnundur, ondan bir şey umulmaz; Saçmadır hər sözü, əsla tutulmaz.* H.Cavid. [Məhərrəm] *yenə arabir saçma sözlər söyləyirdi.* A.Şaiq.

**SAÇMAQ** *f.* Yaymaq, səpmək, tökmək. *Günəşin şüaları qüvvədən düşmüş və yayda saçdığı hərarəti verməkdən aciz idi.* T.Ş.Simurq. *Sifətində şəfəq saçan; Bir sevincdir, bir də bahar.* N.Xəzri. *Başı üstündə o tiflin dayanan; Bəs o kimdir ürəyi gizli yanan; Saçan ətrafa o nur şöləsini; Anadır, bəsləyir öz körpəsini.* M.Dilbazi.

**SAÇMALAMA** "Saçmalamaq"dan *f.is.*

**SAÇMALAMAQ** *f.* Mənasız, yersiz sözlər demək; boş, məntiqsiz danışmaq.

**SAÇ-SAQQAL** *is.* Başda, üzdə olan tüklər. *Saç-saqqalını vurdurmaq*. – [Hüseyn:] *Mən sizi 6-7 ay əvvəl bir kişi ilə bərabər gəzən görərdim. Onun yıpranmış vücudu, bozarmış saç-saqqalı yaşının əllidən artıqlığını bildirirdi*. S.Hüseyn. *Saç-saqqalında bir dənə də ağ tük yox idi*. M.Hüseyn.

◊ **Saç-saqqal ağartmaq** – b a x **saçını-saqqalını ağartmaq**. *Sən səhnədə saç ağartdın, doğrudan da sənətkarsan; Sən daima ətir saçan, güllər açan bir baharsan*. S.Vurğun. [Qoca:] *Biz köhnələr bu çöllərdə çox vuruşmuşuq, saç-saqqalımız bu işdə ağarıbdır*. H.Nəzərli. **Saçı-saqqalı bir-birinə qarışmış** – səliqəsiz, pəjmürdə, dalğın halda. *Dükan qabağında isə saçı-saqqalı bir-birinə qarışmış bir dustaq dayanmışdı və Babək tələsik cibindən bir daraq çıxartdı*. Ə.Məmmədxanlı. **Saçını-saqqalını ağartmaq** – bir işdə uzun müddət işləyib qocalmaq. [Alı] *ömrünü, gününü* [paşanın] *qapısında çürüdüb, saçını-saqqalını ilxı dalında ağartmışdı*. "Koroğlu". [Baba:] *Saçımı-saqqalımı bağ-bağça işində ağartmışam*. Mir Cəlal. **Saçının-saqqalının ağaran vaxtında** – qocalanda, qoca vaxtında. *Ancaq budur, saçının-saqqalının ağaran vaxtında yenə dinc dayanmamış, gedib cavanlara qoşularaq Gülsənəmi "od parçalarının" içində tək qoymuşdu.* V.Şıxlı.

**SAÇSIZ** *sif.* Başında saç, tük olmayan; tüksüz, daz.

**SAÇŞƏKİLLİ** *sif.* Saçabənzər, saç kimi, saç nazikliyində.

**SAÇYOLMA**: **saçyolmaya çıxmaq** – bərk dalaşmaq, bir-birinin saçını yolmaq (ancaq qadınlar haqqında). *Ara qarışır, ana-qız düşürlər Haf Səkinənin üstə, saçyolmaya çıxırlar.* M.Əliyev.

**SADAĞA** b a x **sədəqə**. *Sadağa saraydan çıxmaz*. (Ata. sözü). *Bənövşələr başın salsın aşağa; Nərgiz olsun gözlərinə sadağa.* Q.Zakir. *Ələsgər sənə sadağa; Üzün məndən niyə döndü?* Aşıq Ələsgər.

**SADAQ** *is. köhn.* Oxqabı. *Siyirə qılıncı, çəkə qalxanı; Səksən oxu sadağından boşala.* "Koroğlu". [Qaragünün] *başının üstündən, divarda .. bir qılınc, qalxan, yay və sadaq asılmışdı*. M.Rzaquluzadə.

**SADALAMA** "Sadalamaq"dan *f.is.*

**SADALAMAQ** *f.* Adbaad, bir-bir saymaq. *Ev şeylərini bir-bir sadalamaq. Uşaqların adını sadalamaq. – Bundan əlavə, yenə də qeyri səbəblər ola bilər, hamısını sadalamağa ehtiyac yoxdur*. F.Köçərli. *Nəyiniz var? – soruşdum; O mənə daş-qaşlarını sadaladı.* R.Rza.

**SADALANMA** "Sadalanmaq"dan *f.is.*

**SADALANMAQ** *məch.* Adbaad, bir-bir sayılmaq. *Məqalədə ancaq faktlar sadalanır. – Gəldim, dərdim azala; Dərd ta da sadalandı.* (Bayatı).

**SADƏ** *sif.* [*fars.*] 1. Mürəkkəb olmayan, çətin olmayan, asan həll olunan, bəsit, asan. *Sadə məsələ. Sadə iş. – Bu şərtlər olduqca sadə idi*. S.Hüseyn. [Orxan:] *Bət-bənizin solmuş, çöhrən dəyişmiş; Qolay sanma, deyil bu sadə bir iş.* H.Cavid.

2. *xüs.* Tərkibcə bəsit olan, qatışığı olmayan, mürəkkəb olmayan. *Sadə cisim. Sadə mexanizm*.

3. Təbii, adi, təmtəraqsız, sünilikdən uzaq, hamının başa düşəcəyi şəkildə, populyar. *Sadə danışıq. Kitab sadə dildə yazılmışdır. – Telli arvadın sadə sözləri Qaraşın fikrini işıqlandırdı.* M.İbrahimov. *Bəzən əmisinin oxuduğunu arvadlar başa düşmədikdə Qadir sadə dillə bunu onlara izah edərdi.* Ə.Əbülhəsən.

4. Heç bir şeylə başqalarından fərqlənməyən, ən adi, bəzək-düzəksiz, zinətsiz. *Sadə geyim. Sadə şey. Sadə yemək. – Beş il əvvəl mən* [Xədicəni] *zəngin bir əlbisədə görmüşdüm. İndi isə sadə bir libas geymişdi*. S.Hüseyn. *Qaratel sadə çit don geyib başına ağ krepdeşin örpək örtmüşdü.* Ə.Əbülhəsən.

5. Heç bir imtiyazı olmayan, adi, hamı kimi. *Sadə fəhlə. Sadə müəllim babadır. – Rahatlıq bilməyib çalışan alimlərin vücudları biz sadə bəndələr üçün çox bahadır.* C.Məmmədquluzadə. // Cəmiyyətin zəhmətkeş hissəsinə mənsub olan; əməkçi, zəhmətkeş. *Dünyanın sadə adamları*.

6. *məc.* Ürəyiaçıq, sadədil, sadəqəlbli, biclik bilməyən, tezinanan. *Çox sadə adamdır, hər şeyə inanır. – Əğyarə inanma, gözəlim, qorxuram ondan; Çox sadəsən, hər söz ki deyirlər, inanansan*. Ə.Vahid.

**SADƏCƏ** *sif.* və *zərf* 1. Sadə. [Cənnətəli:] *Mənim cəmi şeirlərim belə abdar, belə sadədir*. Çəmənzəminli. *Dumanlı dağlara boylanıb durur; İndidən sadəcə rəsmlər qurur*. S.Vurğun. [Qız] *güllü çitdən sadəcə don geymiş, qalın hörüklərinin birini döşündən, o birini arxasından sallamışdı.* M.Hüseyn.

2. Ancaq, yalnız. *Sadəcə mən gəldim. – Belə şirniyyat bişirməyə imkanı olmayanlar bayramı sadəcə xuşgəbarla keçirərdilər*. H.Sarabski. *O, bu sözlərə sadəcə gülümsünüb, heç bir cavab vermədi.* M.Rzaquluzadə. ☐ **Sadəcə olaraq** – "sadəcə" demək olub, mənanı bir qədər gücləndirir. *Sadəcə olaraq tərslik eləyir.*

**SADƏDİL** *sif.* [*fars.*] Ürəyi sadə, ürəyi təmiz, hiyləbilməz; sadəqəlbli, safürəkli. *Sadədil adam. – Biçarə, sadədil, zavallı aşıq; Danışma bu sözü, danışma artıq*. M.Müşfiq. // Avam, hər şeyə inanan, yazıq. *Sadədil muzdur indi anladı ki, uzunboylu, qarabığlı müsafir xozeyin deyilmiş, oğru imiş*. S.M.Qənizadə. *Sadədil qadın Əşrəfin sözlərindən son dərəcə məmnun qaldı*. A.Şaiq. // İs. mənasında. [Şeyda Məcid əfəndiyə:] *Əcəba, qüsur kimdə? ..Məcid əfəndidəmi? Yoxsa ondan insaf, mərhəmət uman sadədillərdəmi?* H.Cavid. // Avamlıq.

**SADƏDİLLİK** *is.* Sadədil olma, ürəyisaflıq, ürəyitəmizlik, hiyləbilməzlik, sadəqəlblilik, safürəklilik. *Nazlı isə onun barəsində, sadədilliklə* (z.) [Veysdən] *soruşmuşdu*. Ə.Əbülhəsən.

**SADƏQƏLB** [*ər.*] bax **sadədil**.

**SADƏQƏLBLİK** *is.* bax **sadədillik**.

**SADƏLƏŞDİRİLMƏ** "Sadələşdirilmək"dən *f.is.*

**SADƏLƏŞDİRİLMƏK** *məch.* Sadə hala salınmaq, daha sadə edilmək, bəsitləşdirilmək, asanlaşdırılmaq.

**SADƏLƏŞDİRMƏ** "Sadələşdirmək"dən *f.is.*

**SADƏLƏŞDİRMƏK** *f.* Sadə şəklə salmaq, bəsitləşdirmək, asanlaşdırmaq. *Sxemi sadələşdirmək. Maşının konstruksiyasını sadələşdirmək. Orfoqrafiyanı sadələşdirmək. – Məşədibəy izahını daha da sadələşdirdi.* M.Hüseyn. // *məc.* Bəsitləşdirmək, bayağılaşdırmaq, məzmunsuzlaşdırmaq, dayazlaşdırmaq, lorulaşdırmaq. *Hadisələrin mənasını sadələşdirmək. – Tərlanov məsələni həddindən artıq sadələşdirir*. H.Seyidbəyli.

**SADƏLƏŞMƏ** "Sadələşmək"dən *f.is. Hər şey sadələşmədə, sən də sadələş; Bir insan kimi.* M.Müşfiq.

**SADƏLƏŞMƏK** *f.* Daha sadə (bəsit) olmaq, bəsitləşmək; asanlaşmaq.

**SADƏLİK** *is.* 1. Sadə şeyin halı, bəsitlik. *Layihənin sadəliyi*.

2. *məc.* Sadədillik, safürəklilik, düzürəklilik, hiyləbilməzlik, avamlıq dərəcəsinə çatan sadəlövhlük. *Sadəliyindən, avamlığından* [Səriyyə] *hələ də başına gələn müsibəti tamamilə dərk edə bilmirdi*. M.İbrahimov. *Xasay öz sadəliyinə istehza ilə güldü.* M.Hüseyn. // Hərəkətində, davranışında adilik, təbiilik, sünilikdən uzaqlıq; təvazökarlıq. *Əvvəl gözəllərdə gərəkdir çağlıq; Ondan sonra ola sadəlik, ağlıq.* M.P.Vaqif. *Pudradan, boyadan xoşlanmaz Xumar; Onun qəlbi qədər sadəliyi var*. S.Vurğun. *Gözlərində və sözlərində elə bir sadəlik və səmimilik vardı ki, bu, dinləyənlərə də sirayət edirdi.* M.Rzaquluzadə.

**SADƏLÖVH** [*fars.* sadə və *ər.* lövh] 1. Bax **sadədil**. *Məryəm on iki yaşında, qırmızıyanaq, sadəlövh bir qız idi.* Çəmənzəminli. *Sadəlövh arvadlar Cavahirin cavabından xəbərdar olandan sonra güman edirdilər ki, Cavahirin taqsırını bağışlayıb, onu tamamilə azad edəcəklər.* T.Ş.Simurq.

2. *sif.* və *zərf* Avamcasına, çox sadə. *Dostunun sualı Cəmilə çox sadəlövh göründü.* M.Hüseyn.

**SADƏLÖVHANƏ** *zərf köhn.* Sadəlövhcəsinə, avamcasına. *Bir az sükutdan sonra Kərbəlayı Məhəmməd sadəlövhanə bir maraq ilə başladı.* Çəmənzəminli.

**SADƏLÖVHCƏSİNƏ** *zərf* Sadəlövh adam kimi; avamcasına, cahilcəsinə, sadədilliklə. *Lalə qonşusunun sadəlövhcəsinə dediyi bu sözləri bəyənmədi.* M.Hüseyn. *Onun etirafına belə sadəlövhcəsinə* [Sultanın] *inandığını görən Qoşqar özünü gülməkdən saxlaya bilmədi.* İ.Hüseynov.

**SADƏLÖVHLÜK** bax **sadədillik**. *..Hətta millətin dərisini soyan adamlar da millətpərəstlikdən dəm vurub, millət belə gəldi, millət belə getdi deyirlər. Bunların söylədiklərinə inanmaq .. sadəlövhlük deyilmi?* F.Köçərli.

[Qədir] *aldandığını, bu bağışlanmaz sadəlövhlüyünü bir də xatırladı*. Mir Cəlal. ◻ **Sadəlövhlük etmək** – ürəyi təmiz olduğuna görə hər şeyə inanmaq, yaxud avamcasına hərəkət etmək. *Biz düşünürdük ki, yoldaşımız Haşım sadəlövhlük edərək, heç də inspektorun bilməsi lazım olmayan sirrimizi açmışdır.* T.Ş.Simurq. *Ancaq onda, onunla heç bilmirəm niyə mən; Sadəlövhlük edərək; Yeyib-içdim sübhəcən.* Z.Xəlil.

**SADƏÜRƏKLİ** *sif.* Ürəyi sadə olan, hər şeyə, hər kəsə tez inanan; sadəlövh, sadədil. *..Müəllim on yaşında sadəürəkli və heç şeydən xəbəri olmayan bir uşağın sözünə inanmayaraq: – Səni qara basıb, – deyə cavab verdi*. B.Talıblı. *..Dürdanə xanım xoştəbiətli, sadəürəkli, nazik, bir qədər mövhumatçı bir adamdı*. Ə.Əbülhəsən.

**SADİQ** *sif.* [*ər.*] Sədaqəti olan, sədaqətli, vəfalı. *Xacə Mübarək vaqiən çox saf və sadiq adam idi*. M.F.Axundzadə.

**SADİQANƏ** *zərf* [*ər.* sadiq və *fars.* ...anə] Sədaqətlə, ürəkdən, sədaqətli bir dost, yoldaş kimi. *Rövşən olan etila sabahı; Payına yetər bu qəm, bu möhnət; Yad et məni, sadiqanə yad et.* A.Səhhət.

**SADİQLİK** *is.* Sədaqətlilik, vəfalılıq, sədaqət, dostluqda sabitlik. *Eşqdə sadiqlik izhar etdi dağın göstərib*. Füzuli. [Ağa Bəşir:] *Ağa Cabbar, sən mən axmağa de ki, bu mərtəbədə saf və sadiqlik olarmı ki, elə hər zada inanırsan?* M.F.Axundzadə.

**SADİR** [*ər.*]: **sadir olmaq** – çıxmaq, baş vermək, zahir olmaq. [Ağa Həsən:] *Xanım, nə taqsır məndən sadir olubdur ki, məni özündən uzaq edirsən?* M.F.Axundzadə. [Yaşlı kişi:] *Məndən heç bir* "*günah*" *əmr sadir olmamışdır*. S.Hüseyn.

**SADİST** Sadizmə tutulmuş adam. *Bilirsənmi, Fərman bəy müəllimləri atının quyruğuna bağlayıb sürütdürür. Onun vərdişi belədir... O, çoxdanın sadistidir*. M.Hüseyn.

**SADİZM** [XVIII əsr fransız yazıçısı de Sad-ın adından] 1. Öz ehtiraslarını təmin etmək üçün o biri şəxsə əziyyət vermək, onu incitməkdən ibarət cinsi pozğunluq.

2. *məc.* Başqasına, ya başqalarına işgəncə, əziyyət verməkdən, incitməkdən, başqalarının əzab və iztirabından həzz alma.

**SAƏT** *is.* [*ər.*] b a x **saat**. *İraq olsun yaman gözdən, nə xoş saatdir ol saət.* Füzuli. *Vaqif ilə döndü bir saətimiz; Nə səbrimiz qaldı, nə taqətimiz.* M.P.Vaqif.

**SAF** *sif.* [*ər.*] 1. Tərkibi təmiz olan, heç bir qatışığı olmayan, xalis qatışıqsız. *Saf qızıl. Saf inci. Saf metal.* – *Ələsgərin ağlın aldın sərindən; Saf gövhərsən, sərraf seçib dərindən.* Aşıq Ələsgər. [Bəxtiyar:] *Saf incidir hər bir sözü; Onu seçməz qoca gözü.* A.Şaiq. *Bizi yola saldı Bakıdan bahar; Ləpələr Xəzərdə saf gümüşdülər*. N.Xəzri.

2. Sağlam, zədəsiz, salamat. *Saf bədən. Saf ürək. Saf qan.* – [Zakir:] *Hüsnünə xiridar olandan bəri; Saf cana yetişib ziyan əlindən.* Q.Zakir. [Oğlan] *..güləndə dodaqlarının arasından sədəf kimi saf dişləri ağarırdı.* M.Rzaquluzadə.

3. Təmiz, aydın, parlaq, duru, şəffaf. *Ay saf göydə öz gediş sürətini artırmış, ağ pambıq kimi seyrək buludlar onu gəlin aparan kimi əhatə etmişdilər.* H.Nəzərli. *Duman tərk eləyir dağlar qaşını; Göstərir saf sular Ayı, ulduzu.* N.Xəzri.

4. *məc.* Təmiz, düz, namuslu. *Saf adam.* – *Xacə Mübarək vaqiən çox saf və sadiq adam idi.* M.F.Axundzadə. *Qaratel İkramın xətrini çox istəyir, onu öz atası Qafar kimi saf və təmiz olduğuna şübhə eləmirdi*. Ə.Əbülhəsən. // *məc.* Ləkəsiz, səmimi. *Saf məhəbbət. Saf duyğu. Saf qəlb.* – *Təmiz qəlbimdəki saf niyyətimi; İstəyirsən bir də yoxla, sevirəm.* S.Rüstəm. ◻ **Saf eləmək** – təmizləmək, saflaşdırmaq, qatışıqlardan təmizləmək. *Deyirlər şireyi-innab təndə qanı saf eylər; Çox əmdim ləli-yarı, görmədim, Seyyid, bir asarın*. S.Ə.Şirvani. *Ələsgər istər ki, bir bahar ola; Əridib gövhəri saf eyləmişəm*. Aşıq Ələsgər.

◊ **Özünü safa çıxar(t)maq** – b a x **çıxar(t)maq** ("**öz**"də). *İnsafdan xaricdir ki, biz öz qüsurumuzu bilkülliyyə özgənin boynuna atıb, özümüzü safa çıxardaq*. F.Köçərli.

**SAF-ÇÜRÜK: saf-çürük eləmək** – 1) bir şeyin safını çürüyündən ayırmaq. *Meyvəni saf-çürük eləmək*; 2) *məc.* seçmək, ayırmaq, özlüyündə qiymətləndirmək, yaxşını pisdən ayırmaq. *Aşıq gözü sərraf olar, bircə dəfə baxmaqla adamları saf-çürük eləyər.* "Koroğlu". [Qüdrət:] *Mən dinlədiyim adamların*

*fikrini öz-özlüyümdə saf-çürük eləmişəm.* M.Hüseyn.

**SAFDİL** [*ər.* saf və *fars.* dil] b a x **safürəkli**. [Həsənqulu bəy:] *..İndi mən onu demək istəyirəm ki, həmin o kənarda oturan Məşədi İbad həmin o safdil adamların ən böyüyüdür*. Ü.Hacıbəyov. *Otağın rahat və uyğunluğundan, qulluqçunun safdil və gözəlliyindən başqa, student üçün bir ayrı məsələ də var: bu da xanımın xoşsifətliyidir*. Çəmənzəminli. ☐ **Safdildən** – ürəkdən, təmiz qəlblə, səmimi olaraq, səmimiyyətlə. *..Otello dəxi ona aşiq olmağını bildirib, bir-birinə safdildən məhəbbət bağladılar*. F.Köçərli.

**SAFDİLLİLİK** b a x **safürəklilik**.

**SAFQANLI** *sif.* Qanı saf, təmiz; əsil, cins. *Safqanlı minik atları*.

**SAFQANLILIQ** *is.* Qanı təmiz olma; əsillik, cinslilik.

**SAFQƏLBLİ** b a x **safürəkli**. [Yaşlı kişi:] *Anamın mənimlə* [Şirinnazın] *arasında tərcümanlıq etməsi safqəlbli bir kəndli qadın olan Şərəf xalaya xoş gəlmədi.* S.Hüseyn.

**SAFQƏLBLİLİK** b a x **safürəklilik**.

**SAFLAMA** "Saflamaq"dan *f.is.*

**SAFLAMAQ** *f.* Tərkibini qatışıqlardan təmizləmək, safları çürüklərdən ayırmaq, saf-çürük eləmək.

**SAFLAŞDIRICI** *sif.* Saflaşdırma üçün olan, təmizləyici. *Saflaşdırıcı maşın, qurğu.*

**SAFLAŞDIRMA** "Saflaşdırmaq"dan *f.is.*

**SAFLAŞDIRMAQ** *f.* 1. Qatışıqlardan təmizləyib saf hala salmaq.

2. *məc.* Sağlamlaşdırmaq, gümrah etmək. [Piri baba:] *Erkən durmaq yaxşı şeydir, bədəni saflaşdırır*. S.S.Axundov.

**SAFLAŞMA** "Saflaşmaq"dan *f.is.*

**SAFLAŞMAQ** *f.* Qatışıqlardan təmizlənmək, saf hala gəlmək, təmizlənmək. // Durulmaq, şəffaflaşmaq.

**SAFLIQ** *is.* 1. Saf olma, təmiz olma, qatışıqlardan təmizlənmiş, saf şeyin halı. *Metalın saflığı. Qızılın saflığı. Toxumun saflığı. – Vaqifəm, çox əla bir gövhər idim; Saflıqda polada bərabər idim.* M.P.Vaqif.

2. *məc.* Təmizlik, şəffaflıq, aydınlıq. *Oxqay! ..Havadakı saflığa bax bir; Könül təzələnir, can təzələnir*. B.Vahabzadə.

3. *məc.* Mənəvi təmizlik, düzgünlük, doğruluq, namusluluq. *Ay yenə də gülümsədi... saçlarını dağıdaraq; Dedi, insan qəlbindəki sadəliyə, saflığa bax!* S.Vurğun. *Eldar hələ gözünün yaşı qurumamış, gülümsəyən bir körpə saflığı ilə, qəzəbli üzündə xəfif bir təbəssümlə mənə baxdı.* M.Rzaquluzadə.

**SAFÜRƏKLİ** *sif.* Ürəyi saf, təmiz olan; səmimi, təmizürəkli, açıqürəkli. *Safürəkli adam*. – [Qız:] *Aydın çox mütaliə sevən, yoldaşlıqda möhkəm, safürəkli bir gəncdir.* M.Hüseyn. *Gülşənə elə gəlirdi ki, göy üzü bəzən ona görə ləkəsiz və şəffaf görünür ki, onun altında Qəhrəmanlar kəndində safürəkli, xoşdiləkli, həqiqi məhəbbətli gənclər yaşayırlar.* Ə.Vəliyev.

**SAFÜRƏKLİLİK** *is.* Səmimilik, ürəyiaçıqlıq, təmizürəklilik.

**SAĞ**[1] *sif.* 1. Diri, canlı, ölməmiş, salamat (*ölü* əksi). *Atası hələ sağdır. Sağ qalsaq görərik. – Bəy xanımın əlini alıb .. dedi: – Nə qədər mənim canım sağdı, sənə mən nökərəm, ay xanım!* C.Məmmədquluzadə. [Sultan bəy:] *Ay... rəhmətlik Sona, sağ olaydı..* Ü.Hacıbəyov. *Hər könüldən bir səs gəlir; Ölməmişəm, sağam! – deyə.* S.Vurğun.

2. Sağlam. *Bu xəstələrin qanını dəyişdirib ondan maya qayırıb onu sağ adamın bədəninə çiçək döyən kimi döyüb onları bu xəstəlikdən mühafizə edirlər.* H.Zərdabi. // Salamat, zədəsiz. *Nə birincin, əgər nə yağın var; Şükr qıl, sağ əlin, ayağın var.* S.Ə.Şirvani. ☐ **Sağ gün** – xəstə olmayan gün (daim xəstə olan adam haqqında). *Cahanın sağ günü yatacaqda keçirdi*. İ.Musabəyov. **Sağ qalmaq** – salamat qalmaq, ölməmək, ölümdən qurtarmaq. *Təpə uçdu, dağ qaldı; Maral qaçdı, sağ qaldı; Yar yada qismət oldu; Mənə ağlamaq qaldı.* (Bayatı). **Sağ-islahat (sağ yer) qoymamaq** – tamam hər yerini əzmək, zədələmək, şikəst etmək. *Hasan paşa yanındakı adamlarda sağ-islahat qoymadı.* "Koroğlu". **Sağ yer qalmamaq** – salamat yeri qalmamaq, hər yeri zədələnmək; bərk şikəst olmaq. *Avariyaya düşüb, sağ yeri qalmayıb*. – [Alnı] *o qədər döydülər ki, ağzının, burnunun qanı bir-birinə qarışdı, baş və gözündə sağ yer qalmadı.* Çəmənzəminli.

3. *məc.* Saf, xalis, bütöv, düz. [Əlləzoğlu:] *Neçə ildə bizə bir sağ söz deyib şərt kəsmədin ki, ... mən də arxayın olam.* İ Hüseynov.

◊ **(Çox) sağ ol(un)!** – 1) təşəkkür ifadəsi; təşəkkür edirəm, çox razıyam, minnətdaram. [Şeyx Sənan Özdəmirə:] *Sağ olun, əskik olmayın, oğlum!* H.Cavid. [Camadarlar:] *Çox sağ ol, Məşədi! Allah bərəkət versin!* Ü.Hacıbəyov; 2) vidalaşıb ayrılanda deyilir: salamat qal(ın). [Firidun:] *Sağ ol, Gülnaz, gedirəm. – Gülnazı qapıya qədər .. ötürdü.* M.İbrahimov. **Sağ olsun** – bir kəsin işindən, hərəkətindən məmnunluğu, buna görə də təşəkkürü, razılığı bildirir. *Sağ olsunlar bizi qanan oxucularımız! Avama ümid yoxdur!* C.Məmmədquluzadə. *Bağça müdirəsi dilağız etdi: – Sağ olsun Şirzad yoldaş, gedib rayondan bu avadanlığı aldı, gətirdi.* M.İbrahimov. **(Ay) sağ olmuş** – xitab, ya təşəkkür kimi işlənən ifadə. [Hacı Murad:] *Ay sağ olmuş, mənim ömrüm keçmişdir.* S.S.Axundov. [Bayram kişi:] *Eh, sağ olmuş, hökumət kimdir, biz kimik? Hökumətin bir nümayəndəsi elə lap mən özüm.* M.Rzaquluzadə. **Sağ olmamış** – qarğış məqamında işlənən ifadə.

**SAĞ²** *sif.* 1. Bədənin sol tərəfinin əksi olan hissəsində yerləşən. *Sağ ayaq. Sağ göz. – Usta .. sağ əlini qaldırıb, bir az havada fırladı.* Çəmənzəminli. [Qızın] *sağ yanağındakı bir xal üzünə xüsusi bir gözəllik verirdi.* Ə.Sadıq. // Sol qola müqabil olan qol tərəfdə yerləşmiş. *Alı kişi qabaqca sağ axurdakı ata yaxınlaşdı.* "Koroğlu". *Yanır sağ döşündə qızıl bir nişan.* S.Vurğun. // Üzü cərəyana tərəf durduqda həmin səmtə uyğun gələn. *Çayın sağ sahili. Arazın sağ kənarında.*

2. Siyasi və ictimai həyatda qabaqcıl cərəyanlara düşmən olan; mürtəce, mühafizəkar. // Hər hansı burjua partiyası üzvlərinin, yaxud siyasi, fəlsəfi cərəyan nümayəndələrinin əsas kütləsinə nisbətən daha mürtəce, daha mühafizəkar görüşləri müdafiə edən. *Sağ leyboristlər. Sağ sosialistlər* (*bu məna parlament salonunda mürtəce partiyaların üzvlərinin sədrdən sağ tərəfdə oturması ənənəsindən gəlmişdir*). *Sağ partiyalar.* // İs. mənasında – sağlar. *Sağlara meyil edən qruplar. – Biz açarkən bizə düzgün yollar; Sürünür arxada sağlar, sollar.* M.Müşfiq.

◊ **Sağ əl** *məc.* – ən yaxın adam, köməkçi sirdaş, sədaqətli dost, yoldaş. *Molla Məmməd .. şeyxin sağ əlidir.* E.Sultanov. [Nazlı:] *Mustafa Fərhad qardaşın sağ əlidir.* Ə.Məmmədxanlı. **Sağ əli(n) başıma (başımıza, başınıza, başına)** – birinə qismət olan, nəsib olan yaxşı bir şeyi, xoşbəxtliyi özü və başqaları üçün də arzu etmək mənasında ifadə. **Sağ gözü kimi istəmək** – çox istəmək, həddindən artıq əzizləmək. [1-ci əcinnə:] *Sən qorxma, səni xanım sağ gözü kimi istəyəcək.* Ə.Haqverdiyev. **Sağına-soluna keçmək** – 1) b a x **sağına-soluna göz gəzdirmək**. *Qara şal çuxalı əlindəki siyahıya baxıb məhbusların sağına-soluna keçdi.* Mir Cəlal; 2) yaltaqlanmaq, yaltaqlıq eləmək. *Düşdü əyyar onun ayağına; Soluna keçdi, gah sağına.* S.Ə.Şirvani. **Sağına-soluna göz gəzdirmək** – hər tərəfi yoxlamaq, nəzərdən keçirmək. [Anam] *sağına-soluna göz gəzdirir, yerə baxır, zıqqıldayırdı.* Mir Cəlal.

**SAĞALDICI** *sif.* Sağaldan, şəfa verən, şəfaverici. *Sağaldıcı dərman. Sağaldıcı amillər.*

**SAĞALMA** "Sağalmaq"dan *f.is.*

**SAĞALMAQ** *f.* Xəstəlikdən qurtarıb ayağa durmaq, yaxşılaşmaq, şəfa tapmaq, sağlamlığını qaytarmaq. *O gündən ziyarət başlandı. Naxoş gəldi, sağaldı, getdi. Çolaq gəldi, ayaqlı getdi.* Ə.Haqverdiyev. [Ana qızına:] *Ağlama, gözünə qurban, nə var ki səndə, sağalacaqsan, ağlama, axı evdə qonağımız var.* Ə.Məmmədxanlı. // Keçib-getmək, bitişmək, əvvəlki halını almaq. *Çibanı sağalmaq. Yarası sağalmaq. – Cavadın yarası ağır olmadığından sürətlə sağalmağa başladı.* Ə.Vəliyev.

**SAĞALMAZ** *f.sif.* Heç zaman sağala bilməyən, sağaldıla bilməyən, əlacı, dərmanı olmayan. *Dedi: anlatmışam mətləbi mərdə; Olunacaq çarə sağalmaz dərdə.* H.K.Sanılı. *Lakin son iki ildə* [Gileygüzarov] *sağalmaz bir xəstəliyə düçar olmuşdur.* S.Rüstəm. // Məc. mənada. *Nə batmısan qara sən; Könül yara-yara sən; Nə tükənməz dərd oldun; Nə sağalmaz yara sən.* (Bayatı).

◊ **Sağalmaz dərdə salmaq** – çox ağır bir vəziyyətə salmaq, əlacsız dərdə salmaq, son dərəcə kədərləndirmək, böyük dərd vermək. [Kələntərli:] *Əmirli yoldaş ikimizi də sağalmaz dərdə salıb, qardaş!* İ.Hüseynov.

**SAĞALTMA** "Sağaltmaq"dan *f.is.*

**SAĞALTMAQ** *f.* Müalicə vasitəsilə sağlamlığını bərpa etmək, ayağa qaldırmaq. *Xəstəni sağaltmaq. – Rüstəm kişini əvvəlcə soyuqdəymədən müalicə edərək sağaltmışdılar.* M.İbrahimov. // Məc. mənada. *Hər nə qədər fikrü-xəyal eylədim; Sağaltmadı heç bir çarə dərdimi.* Q.Zakir [Nüşabə:] *Qəlbimdə sızlayan dərin yaranı; Sağaldar ancaq bu qatilin qanı!* A.Şaiq. *Yenə dəniz sahilinin gülərüzlü xoş səhəri; Loğman olub sağaldacaq dərman üçün gedənləri*. S.Vurğun.

**SAĞANAQ** *is.* 1. Qaval, ələk, xəlbir və bu kimi dəyirmi şeylərə keçirilən çənbər; qasnaq. *Dəf sağanağı. Xəlbir sağanağı. Təkər sağanağı.* – [Vəzir:] *Qəflətən* [xəlbirin] *sağanağının bir tərəfini basdıqda, o biri tərəfi qalxıb dizimə elə toxunubdur ki, indi ağrıdan qıçımı qaldıra bilmirəm.* M.F.Axundzadə. [Mirzə Cəmil:] *Zağarası getmiş papaq, sağanağı cırılmış ələk mənə qalmayıb ki!* Ə.Vəliyev.

2. Ümumiyyətlə, çənbər şəklində olan hər cür şey. *Zülfüqar katibin yanından əl çəkmir, şüşəsiz sağanaqdan gözünü bərəldirdi.* B.Bayramov.

**SAĞDIRMA** "Sağdırmaq"dan *f.is.*

**SAĞDIRMAQ** *icb.* Sağmağa məcbur etmək, başqasına sağma işi gördürmək. *İnəyi sağdırmaq. Keçini sağdırmaq.*

**SAĞDIŞ** *is.* Toy mərasimində: bəyin (oğlanın) və ya gəlinin sağ tərəfində oturan, yaxud onları müşayiət edən şəxs. *Sonra sağdışlar* [Şaqqulunu] *aşağı endirib, saldılar gəlin otağına..* Çəmənzəminli. [Bəyin] *yanına öz taytuşlarından iki nəfər rəhbər seçilir. Bunun biri* "*sağdış*", *o biri* "*soldış*"*dır.* R.Əfəndiyev. [Ana:] *Qızım karet içində, üzündə duvaq, yanında sağdışı, soldışı otursun.* A.Şaiq.

**SAĞDIŞLIQ** *is.* Sağdış vəzifəsi, sağdış işi. *Toyda sağdışlıq etmək.*

**SAĞDIŞ-SOLDIŞ** *is.* Toy mərasimində: gəlinin və ya bəyin iki tərəfində oturanlar. *Görüm, ay bəy, toyun mübarək olsun; Sağdışına-soldışına borc olsun.* (El mahnısı). [Günəşin] *göz yaşlarına baxmayaraq, gəlinlik paltarını geyindirib sağdış-soldış ilə bərabər xınaya oturtdular.* A.Şaiq.

**SAĞICI** *is.* İnəkləri sağan və onlara qulluq edən şəxs (əsasən qadın, qız). *Onun təcrübəsini bütün sağıcılar arasında tətbiq edirdilər ..* Ə.Vəliyev. *Sağıcılar içində .. Reyhan xala da var idi*. İ.Əfəndiyev.

**SAĞICILIQ** *is.* Sağıcının işi, peşəsi. *Fermada sağıcılıq etmək.*

**SAĞILMA** "Sağılmaq"dan *f.is.*

**SAĞILMAQ** 1. "Sağmaq"dan *məch. Araz boyundakı şor qışlaqlarda; Doyunca nə qoyun, nə mal sağıldı*. S.Vurğun.

2. Sızmaq, yığılmaq, dolmaq. [Qarı:] *..Mürdəşir Səkinə nağıl eləyirdi ki, Güləndamın gicgahına qan sağılmışdı*. Çəmənzəminli. [Onun] *əlləri əsir, gözlərinin nazik damarlarına qan sağılırdı*. M.Hüseyn. [Xosrov] *qan sağılmış* (f.sif.) *gözlərini açdı*. B.Bayramov.

**SAĞIM** *is.* 1. Sağmaq işi; sağma. *Süd sağımı. Sağıma başlamaq.*

2. Bir dəfədə, ya müəyyən müddət ərzində sağılan südün miqdarı. *Sağım ildən-ilə artır.*

**SAĞIMLI** *sif.* Çox süd verən, sağmal.

**SAĞIN** *is.* 1. B a x **sağım**. *Sabah idi, gün çıxıb xeyli qalxmışdı, mallar yavaş-yavaş sağına gəlirdilər*. A.Divanbəyoğlu. *Günorta çağında olurdu sağın; Yox idi miqdarı pendirin, yağın*. H.K.Sanılı.

2. *dan.* Südverən heyvan, sağılan heyvan. [Nisə xala:] *Mən uzaq yerdən gəlmişəm, malım, sağınım gəlin ümidinə qalıb.* Qantəmir.

**SAĞINÇI** b a x **sağıcı**. [Əhməd:] *Əntiqənin böyüyü-zadı yoxdur, iki il olar ki, atası yataqdan öldü, ..anası da ki sağınçıdı, yamaqçıdı.* Mir Cəlal.

**SAĞINTI** *is.* 1. Bədənin hər hansı bir yerinə sızan, yaxud çıxan qan.

2. B a x **sağın** 2-ci mənada.

**SAĞIR** *sif.* [*ər.*] Kar. [1-ci kor:] *Biz eşitdik yığın-yığın kor, lal; Hər tərəfdən sağır, çolaq və topal; Şeyx Sənana iltica edir.* H.Cavid. // Məc. mənada. *Ellər talan olur, vergilər ağır; Göylər cavabsızdır, buludlar sağır*. S.Vurğun. *Sağır göy altında gələrək vəcdə; Sonsuz bir heçliyə eylədi səcdə*. M.Müşfiq. *Ancaq minarədən ucaldı elə; Sağır göy üzünə* "*Allahü-əkbər*". M.Rahim.

**SAĞIR NUN** *dilç.* Burunda tələffüz olunan "ñ" səsi.

**SAĞIRLAŞMA** "Sağırlaşmaq"dan *f.is.*

**SAĞIRLAŞMAQ** *f.* Karlaşmaq.

**SAĞIRLIQ** *is.* Karlıq.

**SAĞLAM** *sif.* 1. Bədəninin bütün üzvləri düzgün, sağ-salamat olan, normal işləyən, bədəni hər cəhətcə saz olan (*xəstə* ziddi). *Sağlam gənc. Sağlam qadın. Sağlam bədən. – Qırdı şahpərini, kəsdi qolunu; Sağlam bir işçinin iti yumruğu.* M.Müşfiq. *Sağlam bir kişi alaçığa girdi.* İ.Əfəndiyev. // Sağlamlıq ifadə edən, sağlam olduğunu göstərən. *Sağlam görünüş. Yanağında sağlam bir qırmızılıq görünür.* // *məc.* Düzgün, ağıllı, qüsursuz, dürüst. *Sağlam düşüncə. Sağlam tənqid. Sağlam olmayan fikir. Sağlam tərbiyə.* – [Uluca:] *Budur ən doğru və sağlam tədbir; Olsun üç qonşu bu gündən əlbir.* A.Şaiq. *Azadlığın verdiyi nemətlərdən istifadə üçün sağlam şüur və beyin lazımdır.* M.İbrahimov.

2. Orqanizm üçün faydalı, xeyirli; təmiz, saf. *Sağlam iqlim. – Müsafirlərdən bir çoxu: – Bu dağılmışda heç vaxt sağlam bir hava görmədik, – deyə, Culfa mühitinə nifrət yağdırırdı.* M.S.Ordubadi. *Şəhər sağlam, mülayim havanı uda-uda rahatca yuxuya getmişdi.* B.Bayramov. // *məc.* Normal, lazımi. *Sağlam mühit.*

3. *məc.* Möhkəm, sarsılmaz, işə qabil, müqtədir. *Sağlam kollektiv.*

4. *məc.* Sağ, zədəsiz, salamat, xarab olmamış (*çürük* əksi). *Sağlam qoza. Sağlam şitil. Sağlam dəri.*

**SAĞLAMBƏDƏNLİ** *sif.* Bədəni hər cəhətcə sağlam olan, bədəncə möhkəm, saz olan. *Bu sözləri deyən, cavanların lap ortasında dayanmış enlikürəkli, kök və sağlambədənli, gülərüzlü bir oğlan idi.* V.Şıxlı.

**SAĞLAMLAŞDIRICI** *sif.* Sağlamlığı daha da yaxşılaşdırmağa yönəldilən. *Sağlamlaşdırıcı tədbirlər. Üzgüçülüyün sağlamlaşdırıcı əhəmiyyəti son dərəcə böyükdür.*

**SAĞLAMLAŞDIRILMA** "Sağlamlaşdırılmaq"dan *f.is.*

**SAĞLAMLAŞDIRILMAQ** *məch.* Daha sağlam hala salınmaq, səhhət üçün daha münasib bir vəziyyətə gətirilmək. *Müəssisədə əmək şəraiti sağlamlaşdırılmışdır.*

**SAĞLAMLAŞDIRMA** "Sağlamlaşdırmaq"-dan *f.is. Sağlamlaşdırma tədbirləri.*

**SAĞLAMLAŞDIRMAQ** *f.* 1. Sağlam etmək, orqanizmin düzgün, normal fəaliyyətinə çalışmaq. // Sağlamlıq üçün daha əlverişli şərait yaratmaq. *Əmək şəraitini sağlamlaşdırmaq. Ərazini sağlamlaşdırmaq.*

2. *məc.* Daha normal, daha yaxşı, daha sağlam vəziyyət yaratmaq. *Kollektivdə vəziyyəti sağlamlaşdırmaq. Maliyyə işini sağlamlaşdırmaq.*

**SAĞLAMLAŞMA** "Sağlamlaşmaq"dan *f.is.*

**SAĞLAMLAŞMAQ** *f.* 1. Xəstəlikdən sağalmaq, sağlam olmaq, qüvvətlənmək, yaxşılaşmaq, gümrahlaşmaq.

2. *məc.* Möhkəm olmaq, sağlam əhvali-ruhiyyə yaranmaq, yaxşılaşmaq, qaydaya düşmək. [Qoşqar:] *Mən elə bilirdim, Sultandan sonra kollektivimiz xeyli sağlamlaşıbdır.* İ.Hüseynov.

**SAĞLAMLIQ** *is.* 1. Orqanizmin sağlam vəziyyəti; bədən üzvlərinin hamısının düzgün işlədiyi, normal fəaliyyət göstərdiyi hal; gümrahlıq. *Mən bu qadını bir az tanıyırdım, .. qarabuğdayı üzündə bir dirilik, yanaqlarında vücudunun sağlamlığından nəşət edən bir qırmızılıq, gözlərində bir dərinlik mövcud idi.* S.Hüseyn. *Ana bu qollardakı əzələlərin qüvvət və sağlamlığını hiss edirdi.* İ.Əfəndiyev.

2. Səhhət üçün yararlılıq, xeyirlilik, cana xeyirlilik. *Dağ havasının sağlamlığı. Sağlamlığı təmin edən amillər. Ətraf mühitin sağlamlığı.* ☐ **Sağlamlıq ocaqları** – istirahət və müalicəyə xidmət edən, havası sağlam olan yerlər – kurortlar, sanatoriyalar, istirahət evləri və s. *Azərbaycanda sağlamlıq ocaqlarının sayı ildən-ilə artır.* (Qəzetlərdən).

**SAĞLIQ** *is.* 1. Bədənin bütün üzvlərinin sağlam, saz olması, düzgün, normal işləməsi, salamatlıq, səhhət. *Sağlığa ziyan verən şeylərdən qaçmalı. – Abır istəsən – çox demə; Sağlıq istəsən – çox yemə.* (Ata. sözü). ☐ **Sağlıq olsa (olsun)** – 1) salamatlıq arzusu bildirir; inşallah, Allah qoysa. [Qonaqlar:] *İnşallah, sağlıq olsa gələrik... ancaq bir az yolumuz uzaqdır.* E.Sultanov. [Sevil Balaşa:] *Mən hər gün ürəyimi satacaq, beynimə yedirdəcəyəm, sağlıq olsun!* C.Cabbarlı; 2) bəzən hədə mənasında. [Cavad:] *Düşmənin də ömrü bu qar kimi əriyəcəkdir. Sağlıq olsun, səhər gərək onlara bir oyun tutaq ki, atalarının toyu*

*yadlarına düşsün*. Ə.Vəliyev. **(Öz) sağlığında** – yaşadığı zaman, yaşamaqda ikən, sağkən, diri ikən, diriliyində. *Sağlığımda gəlmədin; Barı can verəndə gəl*. (Bayatı). *Öz xələfin gərək gözləyə kişi; Sağlığında ola alış-verişi*. Q.Zakir. [Əmiraslan baba:] *Oğul gərək nəinki öz sağlığında, hətta özündən sonra da ad-san qoysun*. S.Rəhimov.

2. Məclisdə şərəfinə badə qaldırılan şəxsə xitabən deyilən xoş sözlər, tost. *İdris onun sağlığına deyilən tostdan.. xəbərsiz yatırdı*. Ə.Məmmədxanlı. □ **Sağlıq demək** – məclisdə badələri müəyyən münasibətdə içməyi təklif etmək. *Salman konyakın hamısını stəkana süzdü, sağlıq demədən başına çəkdi*. M.İbrahimov. *Həsrət ayaq üstə dayanıb bəylə gəlinin şərəfinə sağlıq deyirdi*. B.Bayramov.

3. **Sağlığın(ız)** şəklində – birindən hal-əhval soruşduqda müsbət mənada cavab kimi işlənir. *– Nə xəbər var, Məşədi? – Sağlığın!* M.Ə.Sabir.

4. **Sağlığına** şəklində – ifadə olunan fikrə danışanın müsbət münasibəti, məmnunluğu bildirilir. *Sağlığına, kefim kökdür*. – [Bəbir bəy:] *Bu saat, sağlığına, pristavın yanında bir sözüm iki deyil*. Mir Cəlal.

◊ **Sağlıqla qal(ın)!** – bax **sağ ol(un)** 2-ci mənada ("**sağ²**"da). *Sağlıqla qal, əziz ana; Ölüm yoxdur qəhrəmana*. N.Rəfibəyli.

**SAĞMA** "Sağmaq"dan *f.is.*

**SAĞMAQ** *f.* 1. Südverən heyvanların yelinindən südü süzüb çıxarmaq. *Camışı sağmaq*. – *Tez durub sübh sağardım inəyi; Xansənəmdən diləməzdim köməyi*. M.Ə.Sabir. [Ayrım qızı:] *İkimiz də cavan idik. Rəhim ağanın qapısında qulluq edərdik,* [ərim] *çoban idi, mən də ağalığın inəklərini sağar, yağ-pendirini tutardım*. A.Şaiq. [Ana Pəriyə:] *Qoy Əşrəf baba keçiləri sağsın, bu saat qonağımız üçün süfrə açarıq*. Ə.Məmmədxanlı.

2. *məc.* Birinin pulunu, malını tədricən əlindən almaq, birindən daim pul və s. çəkmək. [Nəbi:] [Ağamı] *qumarda sağmal inək kimi sağırlar*. S.S.Axundov. *Hacısan, məşhədisən, sahibimizsən, ağasan; İstəyirsən həmi qırxıb bizi, həm də sağasan*. Ə.Nəzmi.

**SAĞMAL** *sif.* Südü olan, süd verən, sağılan. *Sağmal inək*. – [Sürünün] *içində bir dənə də olsun sağmal heyvan yoxdur*. "Koroğlu". *Məclisin hər tərəfindən növbə ilə səslər çıxar: qayınata – bir sağmal camış*. R.Əfəndiyev. [Ailənin] *bir öküzü, bir-iki sağmal keçisi var idi*. Mir Cəlal.

◊ **Sağmal inək** *məc.* – uzun müddət biri üçün gəlir, qazanc mənbəyi olan adam və s. haqqında. *Xərcləri ödəməkçün; dövlət kassası hər gün; bir sağmal inək kimi; bollu-bollu sağılır*. R.Rza.

**SAĞRI** *is.* Heyvanın beli ilə quyruğu arasındakı dolğun və yuvarlaq tərəf. *Atın sağrısı*. – [Dərviş:] [Ruqiyyə] *buzovu onun qabaq ayaqlarına bağladı, özü də inəyin sağrısına dirsəkləndi*. A.Divanbəyoğlu. [Səməd kişi] *axırıncı sözləri deyə-deyə dönüb öküzlərə tərəf baxdı və bir-iki ağac da onların tozlu və arıq sağrılarına "ho, ho" çığıraraq endirdi*. T.Ş.Simurq. // İnsan bədəninin beldən aşağı oturaq hissəsi.

◊ **Sağrı başmaq** – keçmişdə: atın sağrı gönündən hazırlanan başmaq. *Əyləş məclisində, gəlməsini gör; Sağrı başmaq geyib, gəlməsini gör*. Aşıq Ələsgər. *Çəkibdir burnuna qara yaşmağı; Ayaqda dikburun sağrı başmağı*. H.K.Sanılı.

**SAĞRILI** *sif.* Sağrısı dolğun olan.

**SAĞSAĞAN** *is. zool.* Qarğalar fəsiləsindən, ağ-qara tüklü, xarakter səs çıxaran quş; qəcələ. [Fatmanisə:] *Ay oğul, sağsağan qırıldayır, çıx, gör atan gələcəkdirmi?* Ə.Haqverdiyev. *İndi tez-tez sağsağan, qarğa, tək-tək, ikibir, üçbir uçuşan göyərçinlərə rast gəlirdik*. M.Rzaquluzadə.

**SAĞ-SALAMAT** *zərf* və *sif.* Heç bir xətər dəyməmiş, heç bir xataya, bəlaya uğramadan, saz. *Sağ-salamat müharibədən qayıtmaq. Sağ-salamat qalmaq*. – [Əhməd tacirbaşı:] *Allah mənə yar olsa, inşallah, bu dəfə də karvanı sağ-salamat gətirəcəyəm*. "Koroğlu". *Qüdrətin çevikliyi sayəsində qızın sağ-salamat qalmağı hamını sevindirirdi*. M.Hüseyn. [Şahin:] *Ləngidik, ancaq sağ-salamat çıxdıq*. B.Bayramov.

**SAĞ-SALAMATLIQ** *is.* 1. Salamatlıq, ölüm-itim olmama, əmin-amanlıq. *Bizim tərəfdə sağ-salamatlıqdır*. – [Gövhər xanım:] *Hər nə olur olsun, ta ki sağ-salamatlıq olsun*. S.S.Axundov.

2. Hər şeyin öz qaydasında, normal vəziyyətdə olması, heç bir xoşagəlməz hadisənin olmaması. [Telli Qurbana:] *Kolxozda işlər neçədir, sağ-salamatlıqdırmı?* Ə.Məmmədxanlı.

**SAĞ-SOL** *is.* Həm sağ, həm sol; hər iki tərəf, ətraf. *Sağ-soluna baxmaq. Sağ-solunu yoxlamaq. – Gələn atlılar sağa-sola* (z.) *səpələndilər*. M.Hüseyn. *Kiçik evlər şosenin sağ-solunda dururdu.* Ə.Əbülhəsən.

◊ **Sağa-sola sovurmaq** – pulu, malı, dövləti əbəs yerə dağıtmaq, puç etmək. [Əmirxan:] *Əlikram Həmişəyev kimisi sağa-sola sovuranda .. sinəsini qabağa verib qənaət eləyən kim idi?* B.Bayramov.

**SAHƏ** *is.* [*ər.*] 1. Açıq yer, boş və geniş yer, tutulmamış yer; düzən. *Geniş sahə. Qumluq sahə*. // Torpağın müəyyən məqsəd üçün istifadə edilən parçası, qismi. *Həyətyanı sahə. İnşaat sahəsi. Torpaq sahəsi. – Əkin sahəsi çaya lap yaxın olan manqabaşçısı Pəri ora-bura qaçır, çayın o tərəfinə keçməyə can atırdı*. Ə.Vəliyev. *Müdafiə xətti keçən sahələrdən* [taxıl] *kəndə daşınmışdır*. Ə.Əbülhəsən. *Sahə dörd tərəfdən çəkilmiş düz iplərlə əhatə olunmuşdu.* H.Seyidbəyli.

2. Müəyyən məqsəd üçün ayrılan və səthi kvadrat metrlərlə ölçülən yer. *Yaşayış sahəsi. Mənzilin sahəsi 2 kv. metrdir.*

3. Hər hansı bir işin, yaxud elmin, fəaliyyətin ayrıca hissəsi, müstəqil şöbəsi. *Elmin müxtəlif sahələri. Maarif sahəsi.*

**SAHƏCİK** *is.* Balaca sahə, kiçik sahə.

**SAHİB** *is.* [*ər.*] 1. Yiyə. *Bir şeyin sahibi. Bağın sahibi. – At sahibi ilə ev sahibi çuvalları atın üstündən ehmallıca alıb apardılar və sonra atı içəri çəkib qapını bağladılar*. Ə.Haqverdiyev. *At getdiyi yolla da qayıdıb sahibinə yanaşdı.* M.Hüseyn.

2. Köhnə məişətdə: ər mənasında. *Mərhumun, yəni bizim bədbəxt Mahrunun sahibinin başını tapmışlar*. M.S.Ordubadi. [Məmmədbağır] *Sitarənin sahibi olmaqla bütün var-yoxuna sahib olacaqdı*. S.Hüseyn.

3. *köhn.* Bir sıra izafət tərkiblərində yiyə, ağa mənasında işlənir; məs.: sahibi-sərvət, sahibi-əql, sahibi-dövlət və s. *Məzəmmət eyləmə mən binəvanı; Sahibi-səltənət, gövhərin kanı*. Aşıq Ələsgər. [Şeyxlər:] *Oyan şeyx, oyan şeyx, sahibi-kəramət*. H.Cavid.

◊ **Oğul-uşaq sahibi olmaq** – evlənmək, ailə qurmaq, övladları olmaq. [Süleyman:] *Oğul-uşaq sahibi olsunlar!* Ü.Hacıbəyov.

**SAHİBƏ** *is.* [*ər.*] Qadın sahib. [Qəhrəman:] *Qarşımda kişi libası geymiş ev sahibəsi uzanmışdı*. H.Nəzərli. *Qadın içəridə ev sahibəsi əvəzinə Tahiri görəndə donub qaldı*. M.Hüseyn. *Gülü xanım ev sahibəsinin zəhmətə düşməyini istəməsə də, Əlikrama iştaha gəldi.* B.Bayramov.

**SAHİBKAR** *is.* [*ər.* sahib və *fars.* ...kar] Sahib, yiyə. *Bakı fəhlələrinin ümumi tətili sahibkarların qəti məğlubiyyəti ilə qurtarmışdı.* M.Hüseyn. *O zamanlar Bakı neft sahibkarları üçün ev ən böyük gəlir mənbələrindən biri idi.*. S.Rəhman. // Məc. mənada. *Şahinlər bütün aləmlərdə – yerdə də, suda da, havada da əsil sahibkar kimi gəzirlər.* Mir Cəlal.

**SAHİBKARLIQ** *is.* Sahib olma, yiyə olma, yiyəlik.

**SAHİBLƏNMƏ** "Sahiblənmək"dən *f.is.*

**SAHİBLƏNMƏK** *f.* Sahib olmaq, tutmaq, yiyələnmək. *Torpağa sahiblənmək. Bağa sahiblənmək. – Qiymətli kamana sahiblənmək üçün hər kəs qüvvətini sınadı*. M.S.Ordubadi.

**SAHİBMƏNSƏB** *sif.* və *is.* [*ər.*] Yüksək mənsəb, vəzifə sahibi olan, yüksək mənsəbli (vəzifəli). [Hacı Həsən:] *Şeyxəna! Bu Heydər ağadır ki, teleqrafxanada sahibmənsəb və əhli-elm bir vücuddur.* C.Məmmədquluzadə. [İntizari:] *Bir tərəfdən hökumətə qulluq edirsən, bir tərəfdən də sahibmənsəblərə yaman deyirsən?* Ə.Məmmədxanlı.

**SAHİBSİZ** *sif.* 1. Sahibi, yiyəsi olmayan; yiyəsiz, nəzarətsiz. *Maral baxar təpəyə; Özün yıxar təpəyə; Oba sahibsiz olsa; Donuz çıxar təpəyə*. (Bayatı). *Ölkə tamamilə sahibsiz deyildi*. S.Hüseyn.

2. Ata-anasız, yetim, baxımsız. *Mənim yetim uşağa rəhmim gəlir; çünki o uşaq sahibsizdir*. C.Məmmədquluzadə. [Toxucuların] *əksəriyyəti sahibsiz .. uşaqlar idi*. Ə.Məmmədxanlı.

**SAHİBSİZLİK** *is.* 1. Sahibi, yiyəsi olmama.

2. Ata-anası olmama; yetimlik, baxımsızlıq.

**SAHİL** *is.* [*ər.*] Dənizin, çayın, gölün quru ilə birləşdiyi yer; dəniz (çay) kənarı. *O göl sahilinə gələn qıza bax; Sanki budaqlar da*

*ona əl edir.* N.Xəzri. [Dənizin] *ləpələri sahilin isti qumunu yalayaraq irəli cumur, təkrar geri çəkilirdi.* S.Vəliyev.

**SAHİLSİZ** *sif.* Sahili görünməyən, ucsuz-bucaqsız. *Eşqdir çalxanan köpüklü dəniz; Ya fəzadır dərin və sahilsiz.* A.Şaiq.

**SAHMAN** *is.* Qayda, səliqə, düzgün vəziyyət, qaydada, səliqədə olma. *Ev sahmanda idi. Üst-başı sahmandadır. – Qız uşağının paltarı sahmanda idi, başında abı kəlağayı, əynində gödək kofta vardı.* Mir Cəlal. *Hər gün usta buruqlara baş çəkib gəzər; Quyuları sahman görüb fərəhlənərdi.* Ə.Cəmil. ☐ **Sahmana düşmək** – qaydaya düşmək, yoluna düşmək, hər şey öz yerində, qaydada olmaq. [Hümmət Yusifə:] *Bəlkə dedilər, ay eloğlu, ..indi işlər sahmana düşür deyə gəlmisən?* B.Bayramov. **Sahmana gətirmək** – bax **sahmana salmaq**. *Xavərnisə evi yığışdırıb, bağçaları sahmana gətirib də süfrələri hazırlayırdı.* T.Ş.Simurq. **Sahmana salmaq** – qaydaya salmaq, səliqəyə salmaq, hər şeyi öz yerində düzgün yerləşdirmək. [Arvad] *cəld hərəkətlərilə otağın içindəki avadanlığı sahmana salmağa başladı.* H.Seyidbəyli. [Ümid] *..kanalın sahmana salınmasında az zəhmət çəkməmişdi*. B.Bayramov.

**SAHMANLAMA** "Sahmanlamaq"dan *f.is.*

**SAHMANLAMAQ** *f.* Qaydaya salmaq, səliqəyə salmaq, nizama salmaq, düzəldib hazırlamaq. *Mizin üstünü sahmanlamaq. Evi sahmanlamaq. Yorğan-döşəyi sahmanlamaq.* – [Tapdıq] *şananı əlində sahmanlayır, yabanı çəpərə ilişdirir, beləliklə, gününü keçirirdi.* Ə.Vəliyev. *Gəldiyev tez qalxıb üst-başını sahmanlayıb, masasının başına keçmişdi.* Mir Cəlal. // Hazırlıq, tədbir görmək, şərait yaratmaq. *Ya deyirik işləri sahmanlayaq; Məclisi-əyanda vurur tək səbir.* M.Ə.Sabir.

**SAHMANLI** *sif.* 1. Sahmanda, səliqədə, qaydada olan, düzgün, səliqəli. *Sahmanlı ev.*

2. Rahat, qayda-qanunda olan. [Hacı Qənbər:] *Heç bir belə sahmanlı iş olmaz*. N.Vəzirov.

**SAXARİ́N** [*yun.* sakchar – şəkər] Çox şirin ağ kristallik maddə; şəkər surroqatı. *Saxarinlə çay içmək.*

**SAXLAMA** "Saxlamaq"dan *f.is.*

**SAXLAMAQ** *f.* 1. Bir şeyi əlində (ağzında, dişində və s.-də) tutub düşməyə qoymamaq. *Açarı əlində saxlamaq*. *İpi dişində saxlamaq.* – *Başımı aşağı dikib durduğum halda əlimdəki çörək qismətini yumruğumda saxlamağa başladım.* A.Divanbəyoğlu. *Bayram pulu açıb bir neçə dəqiqə əlində saxladı*. M.Hüseyn.

2. Hərəkətini kəsmək, dayandırmaq, əyləmək. *Maşını qapıda saxlamaq. Avtobusu dayanacaqda saxlamaq. – Aralarında ən yaşlıları olan Rəşid atı saxladı.* H.Nəzərli. [Leytenant] *elektrik fanarları ilə işıqlanmış küçənin ortasında motosikli saxladı.* İ.Əfəndiyev.

3. Getməsinə, irəli hərəkətinə mane olmaq, qabağını kəsmək, dayandırmaq. *Uşaqları meydanda saxlamaq. Adamların qabağını saxlamaq. – İnsanlar isə bu köhlən ata kəmənd atır, onu saxlamağa çalışırdılar.* Ə.Vəliyev. *Dürrə.. polislərə çatmağa az qalmışdı ki, kimsə onu saxladı...* S.Vəliyev.

4. Sahib olmaq, həvəskarı olmaq, bəsləmək (heyvan haqqında). *İnək saxlamaq. Arı saxlamaq. İt saxlamaq. – Əmioğlumun peşəsi qoyun saxlamaq idi və qoyunları da kürd çobanlarına tapşırmışdı...* C.Məmmədquluzadə. *..Güman etdim ki, Eldarın saxladığı ya poçt göyərçinləridir, ya da eləcə quşlara rəhmi gəlib onlar üçün hin qayırmışdır*. M.Rzaquluzadə.

5. Yaşamaq üçün lazım olan vəsaitlə təmin etmək, dolandırmaq. *Yetimləri saxlayıb böyütmək. Ev saxlamaq. Uşaqlarını saxlamaq. – Nənəcan mamalıq edib qızını saxlardı və yaxşı da saxlardı*. N.Nərimanov. [Ana Nərgizə:] *Axı indi mən evi təkbaşıma saxlayıram, qızım, nahaq yerə niyə pul xərcləyək?* Ə.Məmmədxanlı.

6. Mühafizə etmək, qoruyub saxlamaq. *Ana gəlinlikdən bir örpək saxlayırdı*. C.Cabbarlı. *Kərimbəy, kim bilir, haçandan saxladığı təzə, tiftik əlcəyi Nərimana verdi.* Mir Cəlal.

7. Gizlətmək, heç kəsə göstərməmək. *Qiymətli şeyləri sandıqda saxlamaq. Sənədləri seyfdə saxlamaq*. – [Gülbahar Məmmədkərimə:] *Portfelinizi ayaq altına niyə qoymusunuz? Veriniz, şkafda saxlayım*. H.Nəzərli. // Bir sözü, sirri və s.-ni heç kəsə deməmək, yaymamaq, gizli saxlamaq. [Dəmirqaya:] *Hərbi sirri möhkəm saxlamamışdır.* H.Nəzərli.

8. Dayaq olmaq, yıxılmağa, uçmağa qoymamaq. *Tirləri divar saxlayır. Balkonu dörd sütun saxlayır*.

9. Ehtiyat görmək, qoruyub saxlamaq. *Qışa buğda saxlamaq*. – *Saxla samanı, gələr zamanı*. (Ata. sözü).

10. Müəyyən bir məqsəd ünün özünə köməkçi, xidmətçi tutmaq. *Qulluqçu saxlamaq*. – *Varlıların çoxu özlərini və mədənlərini qorumaq məqsədilə yanlarında qoçu saxlayırdılar*. A.Şaiq. [Yaşlı kişi:] *Hacı Mirzə Baba mənə bir xidmətçi və ya aşpaz saxlamağı təklif etmişdisə də, qəbul etməmişdim*. S.Hüseyn. *Hacı Səmsam .. oğlu üçün lələ saxlamırdı*. P.Makulu.

11. Əvvəlki keyfiyyətini mühafizə etmək, qorumaq. *Gözəlliyini saxlamaq. Dişini yaxşı saxlamaq*. – "*Molla Nəsrəddin*" *realizmi və satirası yenə də öz inkaredici, ifşaedici xüsusiyyətlərini saxlayır*. M.İbrahimov. *Yarpaqlar hələ də öz təravətini saxlayırdı*. M.Hüseyn.

12. Bir yerdə qalmağa, durmağa məcbur etmək. *Komandanı arxların dərin bir yerində saxlamaq lazım idi*. H.Nəzərli. *Firidunu polk qərargahının qarşısında saxlamışdılar*. Mir Cəlal. // Hər hansı bir vəziyyətdə qalmağa məcbur etmək. *Şəhəri mühasirədə saxlamaq. Cəhalətdə saxlamaq. Şeyləri səliqəli saxlamaq. Təhlükə altında saxlamaq*.

13. Sözünü, işini və s.-ni davam etdirməyə qoymamaq, yarımçıq kəsmək. *Elə burda saxla. Yığıncağı saxlamaq*. – *Saxlayıb iclası elə bu zaman; Süzür vuruşmanı igid pilotlar*. M.Rahim.

14. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: ayaq saxlamaq, dilini saxlamaq, başını saxlamaq, özünü saxlamaq, göz üstə saxlamaq və s.

**SAXLANC** *is*. Ehtiyat üçün saxlanılan şey, yaxud içində şey saxlanılan qab və s. *Yollara gül-çiçək saçsın gələcək; Ona qonaq gəlir yeni nəsillər; Açsın saxlancını şanlı fəsillər*. M.Müşfiq.

**SAXLANILMA** "Saxlanılmaq"dan *f.is*.

**SAXLANILMAQ** "Saxlamaq"dan *məch*. *Bu kitablar gizli saxlanılmalıdır*. H.Nəzərli.

**SAXLANMA** "Saxlanmaq"dan *f.is*. *Qonaqlar şəhərdə, elmlilər evinin eyvanında toyuqcücə saxlanmasına gülüşdülər*. B.Bayramov.

**SAXLANMAQ** 1. B a x **saxlanılmaq**. *Kənd təsərrüfat alətləri yay-qış uçuq-sökük, qar-yağış tökülən bir xarabalıqda saxlanırdı*. M.İbrahimov. *Üçüncü darvaza sağ yandan .. mal-qara və bir neçə at saxlayan* (f.sif.) *tövlələr tərəfə açılırdı*. Ə.Əbülhəsən.

2. *qayıd*. Özünü bu və ya digər vəziyyətdə saxlamaq, gizlənmək. *Pərdədə saxlanma, çıx, ey sevgili dildarımız*. M.Hadi.

**SAXLAŞDIRMA** "Saxlaşdırmaq"dan *f.is*.

**SAXLAŞDIRMAQ: özünü saxlaşdırmaq** – özünü saxlamaq. *Professor cənabları da özünü saxlaşdırmadı və daha da ucadan qah-qah çəkib Zəki Əfəndiyə dedi: – Qulaq as, mən başdan oxuyum*. C.Məmmədquluzadə. *Rəfizadə özünü saxlaşdıra bilmədi*. M.S.Ordubadi.

**SAXLATDIRMA** "Saxlatdırmaq"dan *f.is*.

**SAXLATDIRMAQ** b a x **saxlatmaq**. *Firidun qəsdən maşını iki ev aralı saxlatdırıb düşdü*. M.İbrahimov. *Qalxanda kişilər bəzən davaya; Qılınclar boğaza dirənən zaman; Sən öz örpəyini atıb ortaya; Neçə yol ölümü saxlatdırmısan*. N.Xəzri.

**SAXLATMA** "Saxlatmaq"dan *f.is*.

**SAXLATMAQ** *icb*. Saxlamasını, dayanmasını tələb, ya xahiş etmək. *Faytonu xanım bir az kənarda saxlatdı, qapıya qədər piyada getmək istədi*. Çəmənzəminli. *Əbil maşını saxladıb düşdü*. Ə.Vəliyev.

**SAXSI** *is*. Gildən hazırlanan dulusçuluq məmulatı. *Saxsıya verə-verə, çıxdı misin bahası*. (Ata. sözü). // Saxsıdan qayrılmış. *Qələmkar süfrənin üstünə laciverdi saxsı boşqablarda .. yemişlər qoyulmuşdu*. Çəmənzəminli. *Pəncərədən sarı şamdanlar, bəzi evlərdə isə saxsıdan çilçıraq* (*tunc rəngli*) *asılardı*. H.Sarabski. // Bu məmulatın sınmış parçaları. *Alim yenə qucaq-qucaq yığır qədim saxsıları; Yer altdakı hər kərpicin üstündəki yazıları*. S.Vurğun. *Mən cəbhədə, bir komada şeir yazıram; Yanır saxsı parçasının üzərində şam*. R.Rza.

**SAXSIÇI** *is*. Saxsı qablar qayıran usta; dulusçu.

**SAXSIÇILIQ** *is*. Saxsıçının işi, peşəsi; saxsı qablar qayırma sənəti; dulusçuluq.

**SAXTA** *sif*. [*fars*.] 1. Əsli olmayan, uydurma, yalan, oxşadılaraq qayrılmış və ya

yazılmış; qəlp. *Saxta vəkalətnamə. Saxta etibarnamə. – Dəstədə olan adamların biri Mirqasımdır ki, doğma bacısı Səkinənin malını yemək qəsdi ilə saxta kağız düzəltmişdi.* C.Məmmədquluzadə. [Mahmud bəy:] *Siz mənə heç inanmayırsınız. Hesabınızda saxta qəbzlər tapıblar.* N.Vəzirov.

2. *məc.* Süni, yapma, yalan, qeyri-səmimi. *Saxta gülüş. Saxta söz. Saxta məğrurluq. – Biz içəri girən kimi Sərdar Rəşid saxta təbəssüm və süni bir məhəbbətlə bizi qarşıladı.* M.S.Ordubadi. *Bir neçə bənddən sonra sanki* [İminin] *üzündəki saxta ciddiyyət niqabını çıxarıb atdılar*. İ.Əfəndiyev.

**SAXTAKAR** *is.* və *sif.* [*fars.*] Saxta, qəlp şey qayıran adam, saxtakarlıqla məşğul olan. *Hər bir xalqın içərisində saxtakar, şərarətçi və axmaq adamların olduğu hamıya bəllidir*. M.F.Axundzadə.

**SAXTAKARLIQ** *is.* Saxtakarlıqla məşğul olma, saxta iş görmə, saxta sənəd və s. düzəltmə. *Balacayevi böyük bir dəhşət bürüdü. Onun boynuna üç təqsir sarınmışdı:* "*saxtakarlıq, israfçılıq və qatillik!*" S.Rəhimov. [Dəmirçi Musa] *saxtakarlığa, ikiüzlülüyə nifrət edir*. İ.Əfəndiyev.

**SAXTALAŞDIRILMA** "Saxtalaşdırılmaq"-dan *f.is.*

**SAXTALAŞDIRILMAQ** "Saxtalaşdırmaq"-dan *məch.*

**SAXTALAŞDIRMA** "Saxtalaşdırmaq"dan *f.is.*

**SAXTALAŞDIRMAQ** *f.* Bir şeyin saxtasını düzəltmək, bir şeyi saxta şəklə salmaq; uydurmaq.

**SAXTALIQ** *is.* 1. Saxta şeyin halı; qəlblik. *Sənədin saxtalığı bilindi*.

2. *məc.* Sünilik, riyakarlıq, ikiüzlülük, qeyri-səmimilik; saxta hərəkət. *Dünyada saxtalığı, ikiüzlülüyü, riyanı və hiyləni sevməyən təmiz və səmimi bir şey varsa, o da sevgidir.* M.S.Ordubadi. [Züleyxa] *..saxtalıq nə olduğunu bilmirdi*. M.İbrahimov. // Yalan, hiylə, kələk.

**SAXURLAR** Azərbaycanın Zaqatala rayonunda və Dağıstanda yaşayan etnik qrup.

**SAİL** *is.* [*ər.*] Dilənçi, yolçu. *Hüsnün sadağası, canın zəkatı; Sail olan binəvayə düşərmi?* Aşıq Ələsgər. [Pəri xanım:] *Dost, aşna, qonaq və sail üzünə həmişə bu qapı açıq olub*. Ə.Haqverdiyev.

**SAİLLİK** *is.* Dilənçilik, yolçuluq. *Səndə kim var bu qədər dövlət; Dəxi sailliyə nədir hacət?* S.Ə.Şirvani. *Saillik etmək Məşədi Əkbər üçün ölümdən ağır görünürdü.* S.M.Qənizadə.

**SAİR** *sif.* [*ər.*] Başqa, qeyri, digər. *Sair məsələlər. – Şabanın getməyini eşidib sair bikar tamaşaçılar da kənardan yığılmışdılar.* Ə.Haqverdiyev. // İs. mənasında, cəm şəklində: sairləri – başqaları, o biriləri, digərləri. *Sairləri də sənin kimi hərəkət etməli. Sairləri də biz deyəni deyəcək.*

**SAİRƏ** *is.* Bir neçə şey sayıldıqdan sonra, onların sayını yenə də davam etdirmək mümkün olduğunu bildirir (bu mənada adətən "və" bağlayıcısı ilə işlənir). *Kitab, kağız və sairə*. – [Pərşan:] *Qadın içəri girəndə kişi ayağa durmalıdır, yer göstərməlidir, paltosunu tutmalıdır və sairə*. M.İbrahimov.

**SAİT** *sif.* [*ər.*] *dilç.* Hava axınının ağız boşluğundan heç bir maneəyə rast gəlmədən keçməsi yolu ilə əmələ gələn (səslər haqqında). *Sait səslər. Azərbaycan dilində 9 sait səs var*. // *İs. mənasında.* Bu vasitə ilə əmələ gələn səs. *Azərbaycan dilinin saitləri.*

**SAJIN** [*rus.*] Metr sisteminin tətbiqindən əvvəl işlənmiş 2,134 m-ə bərabər uzunluq ölçüsü. [Qurban:] *Molla əmi, yaman adamın quyusunda işləyirəm, quyu indi otuz sajından aşağı enmiş*(*dir*). A.Şaiq. [Toğrul] *yüz addım keçdikdən sonra bir sajın hündürlükdə açıqlıq bir təpəyə çatdı.* H.Nəzərli.

**SAJINLIQ** *sif.* Adətən saylarla işlənib sajının miqdarını göstərir. *On sajınlıq quyu.*

**SAKİN** *is.* [*ər.*] 1. Bir yerdə yurd salıb yaşayan, həmin yerin əhalisindən olan; oturan, oturucu. *Mingəçevir şəhərinin sakinləri. Yeni qəsəbənin sakinləri. – Müxtəsər, biz hər ikimiz Danabaş kəndinin sakiniyik*. C.Məmmədquluzadə. *Aulun sakinlərindən heç biri ləkəli namusla yaşamaq istəmədi*. M.Hüseyn. // Yaşayan, yerləşən. *Binanın sakinləri. Mehmanxananın sakinləri. – Üç ildir ki,* [evin] *sakinləri bir qoca qarı, bir də onun nəvəsi balaca Svetlanadır*. Ə.Məmmədxanlı. *Bütün ev sakinləri ya qonaqlar bu darvazadan qəsəbəyə çıxırdılar*. Ə.Əbülhəsən. □ **Sakin etmək**

**(eləmək)** – yerləşdirmək, məskən saldırmaq, oturtmaq. *Hacı həyətdə olan kiçik daxmanı Aslana verdi ki, orada o öz qardaş və bacısını sakin eləsin.* C.Cabbarlı. **Sakin olmaq** – bir yerdə (evdə və s.-də) yerləşmək, yaşamağa başlamaq, məskən salmaq. *Görürəm mən dünən gecə yuxuda; Yenə də sakin olmuşam Bakıda*. M.Ə.Sabir. [Qonça:] *Mənim sakin olduğum evin yaxınlığına bir daha dolaşmayın.* S.Hüseyn.

2. Sakit, səssiz, hərəkətsiz. *Sakin küçələr* [Midhətə] *geniş göründü, əsir şəhər hürr və məsrur idi.* Çəmənzəminli. *Yorğun maral kimi sakin baxışlar; Bir öpüşdən daha kəskin baxışlar; Səndə nələr yoxdur, nələr, ah, nələr...* M.Müşfiq. □ **Sakin olmaq** – sakitləşmək, rahatlanmaq. *Dağlarda əkin olmaz; Heç kəs mən təkin olmaz; Sən yanıma gəlməsən; Ürəyim sakin olmaz.* (Bayatı).

3. Ərəb əlifbasında: hərəkəsiz, hərəkəsi olmayan, hərəkə ilə oxunmayan. *Sakin hərf.* – *Habelə sakin* "*nun*"*dan* ( ن ) *ibarət olan tənvinlər də yazıda qeyd olunmalıdır.* M.F.Axundzadə.

**SAKİT** *sif.* və *zərf* [*ər.*] 1. Bərkdən səslənməyən, yaxşı eşidilə bilməyən, asta, yavaş (*gur, uca* ziddi). *Sakit səs. Sakit danışıq.* – *..Teymur sakit bir səslə əmr etdi.* H.Seyidbəyli. // Davasız, qalmaqalsız, qışqırıqsız, səs-küysüz, həyəcansız. *İşi sakit aparmaq. Sakit danışmaq. Məsələni sakit həll etmək.* – *Əmi ilə qardaşoğlunun söhbəti çox sakit bir ahəngdə başlandı.* M.Hüseyn.

2. Susmuş, sükut içində olan, sükuta batmış. *Sakit gecə. Sakit səhra.* – *Sakit Azərbaycan kəndi üzərinə bir yaz axşamı enirdi.* Ə.Məmmədxanlı. *..Kəndin küçələri qapqaranlıq, həyətlər sakit idi.* M.Rzaquluzadə. // Hərəkətsiz, səssiz-səmirsiz, hay-küysüz, sükunət içində olan. *Sakit şəhər*. *Sakit küçə.* – *Hava sakit və ılıq idi*. İ.Əfəndiyev. *Yoxsa bu ikimərtəbə ağ evlə, bu sakit, sərin, ətirli bağla əlaqədar unudulmuş hisslər yenidən baş qaldırırdı?* İ.Hüseynov.

3. Rahat, həyəcansız, iztirabsız, qayğısız, aram. *Sakit həyat. Sakit iş. Sakit günlər keçirmək. Həyatının ən sakit çağlarında.*

4. Dinc, əziyyət verməyən. *Sakit körpə. Çox sakit uşaqdır.*

5. Mülayim, həlim, yumşaqxasiyyətli. *Sakit baxışlı qara gözlərindən* [Əsgərin] *azərbaycanlı olduğu məlumdu.* Ə.Əbülhəsən. *Çox sakit və təvazökar olan Rəhim iş zamanı çöldə və istirahət zamanı çadır və ya qazmalarda gənclərin yanında olub onların söhbətlərinə diqqət yetirirdi*. Ə.Sadıq.

6. Soyuqqanlı, soyuqqanlılıqla, əsəbiləşmədən. *Poladzadə sakit qulaq asa bilmir, ürəyindən qara qanlar axırdı.* Ə.Vəliyev. □ **Sakit etmək** – yumşaltmaq, ovundurmaq. [Mozalan bəy:] *İndi bu xəyal ilə özümü sakit etmişəm*. Ə.Haqverdiyev. *Ata oğlunu sakit edib əyləşdirdi.* Mir Cəlal. **Sakit olmaq** – sakitləşmək. *Firqətdə lazımdır aşiqə əfqan; Sakit olmaq gərək yarı görəndə.* Q.Zakir. *Lağlağı sözümü kəsib qoymadı vərəqi axıra yetirəm. Mən sakit oldum və özü başladı oxumağa.* C.Məmmədquluzadə.

7. Dinc, rahat, arxayın, həyəcansız. *Qəhrəman bir qədər sakit idi.* H.Nəzərli. *Qəlbimlə, ruhumla qoşuldum elə; Düşüncəm sakitdir o gündən belə*. M.Müşfiq. □ **Sakit etmək** – b a x **sakitləşdirmək**. *Əlahəzrət üsyançı qoşunları sakit etmək və onları tərksilah etdirmək üçün iraqlılardan ibarət bir ordu düzəlməsinə əmr vermişdir.* M.S.Ordubadi. [Malik] *qızı ağır vəziyyətdən qurtarmaq və kəndliləri sakit etmək üçün özü irəli çıxdı*. M.İbrahimov. **Sakit olmaq** – b a x **sakitləşmək**. *Gün batdı. Hər kəs öz evinə və mənzilinə qayıtdı. Şuriş və qovğa sakit oldu.* M.F.Axundzadə. *Ustanın istidən döyünən ürəyi hənadan sonra sakit oldu.* Çəmənzəminli.

**sakit-sakit** b a x **sakitcə**. *Sakit-sakit danışmaq. Sakit-sakit yerimək. Sakit-sakit cavab vermək.* – [Salatın] *Azacıq sonra .. gözlərini açıb döyükdü. Heç nə anlamadan sakit-sakit baxdı.* İ.Şıxlı.

**SAKİTANƏ** *zərf* [*ər.* sakit və *fars.* ...anə] Sükut içərisində, səssiz halda, sakit vəziyyətdə, sakit-sakit. *Bu binanın sakitanə; Duruşunda nə hikmət var?* B.Vahabzadə. // Sakit-sakit, hay-küysüz, səssiz-səmirsiz. *Süzür sakitanə göylər gəlini; Uzadır qələmə Hüseyn əlini*. M.Rahim.

**SAKİTCƏ(SİNƏ)** *zərf* Sakit, sakit-sakit, səssiz, astaca, səs salmadan. *Sakitcə çıxıb getmək.* – *İndi* [Xədicənin] *gözlərindən sa-*

*kitcə axan yaşlar yanaqlarını isladıb axır... axır... bir dürlü bitmək bilməyirdi.* S.Hüseyn. *Pazıxın əlindən geri dartınan at bu dəfə Nisə xalanın əlində sakitcəsinə gedirdi.* Qantəmir.

**SAKİTEDİCİ** b a x **sakitləşdirici**.

**SAKİTLƏNMƏ** "Sakitlənmək"dən *f.is.*

**SAKİTLƏNMƏK** b a x **sakitləşmək**.

**SAKİTLƏŞDİRİCİ** *sif.* Sakit edən, ağrını kəsən; sakitedici. *Sakitləşdirici dərman.*

**SAKİTLƏŞDİRİLMƏ** "Sakitləşdirilmək"-dən *f.is.*

**SAKİTLƏŞDİRİLMƏK** "Sakitləşdirmək"-dən *məch. Uşaqlar sakitləşdirildi. Dalaşanlar sakitləşdirildi.*

**SAKİTLƏŞDİRMƏ** "Sakitləşdirmək"dən *f.is.*

**SAKİTLƏŞDİRMƏK** *f.* 1. Sakit etmək, rahatlandırmaq; rahatsızlığını, iztirabını, həyəcanını aradan qaldırmaq; təskin etmək. [Aslanın] *xoş və təbəssümlü baxışları ən qəzəbli və ya böyük həyəcan keçirən adamı belə sakitləşdirə bilərdi.* S.Vəliyev. *Sərvinaz qarı ilə Əsəd baba Şahmarı dilə tutub güclə sakitləşdirmişdilər.* B.Bayramov. // Özünü sakit aparmağa məcbur etmək. *Uşaqları sakitləşdirmək. Dalaşanları güclə sakitləşdirə bildik.*

2. Yatırtmaq, ləğv etmək. *Qovğanı sakitləşdirmək. Həyəcanı sakitləşdirmək.*

3. Yüngülləşdirmək, ya aradan qaldırmaq, kəsmək. *Diş ağrısını sakitləşdirmək. Əsəbləri sakitləşdirmək.*

**SAKİTLƏŞMƏ** "Sakitləşmək"dən *f.is.*

**SAKİTLƏŞMƏK** *f.* 1. Səs-küy azalmaq, ya kəsilmək, sakitlik düşmək. *Gecədən keçmiş şəhər sakitləşdi. – Günəş günorta yerinə gələndə Tehranın bütün küçələri boşalmış və sakitləşmişdi.* M.İbrahimov. // Sakit olmaq, gücü, şiddəti zəifləmək, yavaşımaq, kəsilmək, keçib getmək. *Dəniz sakitləşdi. Külək sakitləşdi. – Su sakitləşmişdi ki, ikinci, üçüncü və dördüncü bombalar da bir-birindən aralı dənizdəki balaca qayığın ətrafina düşüb partladı.* Ə.Vəliyev.

2. Əsəbiliyi, həyəcanı, iztirabı keçmək; təskinlik tapmaq, rahatlanmaq, müvazinət kəsb etmək. *Əgər Ağca tərəf qalib gəlsə idi, demək olar ki, Şükür sakitləşərdi.* Çəmənzəminli. [Mehriban] *axır zamanlar xeyli sakitləşmişdi.* H.Seyidbəyli. [Zərnigar xanım] *..dava-dalaş salar, ağlayıb-sızlayar, sonra da sakitləşərdi.* İ.Şıxlı.

◊ **Ara sakitləşmək** – b a x **ara**. *Elə ki ara sakitləşdi, Məhbub xanım yavaşca qapını açıb gəldi Bəlli Əhmədin yanına.* "Koroğlu". *Getgedə ara sakitləşdi. Sürülər kövşəyə yatdı.* B.Bayramov. **Ürəyi sakitləşmək** – b a x **ürək**. [Usta Ağabalanın] *istidən döyünən ürəyi öylə bil xınadan sonra sakitləşdi.* Çəmənzəminli. *Əbil Qənbərovun ürəyi bir az sakitləşdi.* Ə.Vəliyev.

**SAKİTLİK** *is.* 1. Səs, danışıq, hay-küy olmadığı hal; tam sükut, səssizlik. *Sakitliyi gözləmək. Sakitlik yaratmaq. Sakitliyi pozmaq. – Elə sakitlik idi ki, nə bir kimsənin səsi çıxırdı, nə də bir yarpaq tərpənirdi.* S.S.Axundov. [Qəhrəman:] *Sükut deyirəm, səhv etməyiniz. Onu ancaq o vaxt sakitlik adlandırmaq olardı.* H.Nəzərli.

2. *məc.* Dinclik, əmin-amanlıq, asayiş, əmniyyət; dinc, sakit həyat. *Hər yerdə sakitlik hökm sürür.* // Müvəqqəti sükut. *Müharibə meydanında sakitlik idi, iki tərəf də evlərinə çəkilmiş idi.* Çəmənzəminli.

3. *məc.* Arxayınlıq, xatircəmlik; iztirab, həyəcan, qayğı olmadığı hal. *Sakitliyini itirmək. – Rüstəm kişini təəccübləndirən Aslanın sakitliyi, hətta Yarməmmədin bir qədər mülayim rəftarı idi.* M.İbrahimov.

**SAKLAR** *is.* Qədim İran tayfalarından birinin adı.

**SAKSAFÓN** [*xüs. addan*] Misdən nəfəsli musiqi aləti.

**SAKSAUL** *is. bot.* Orta Asiya səhralarında bitən alçaq ağac və ya kol.

**SAKSAULLUQ** *is.* Saksaul bitmiş yer, saksaul kolluğu.

**SAKSLAR** *is.* German tayfaları.

**SAKVOYAJ** [*fr.* sac – kisə və voyaqe – səyahət] Bağlanan yeri olan yol çantası. [Həmid] *vaqonda sakvoyajını .. açdı, əczaların əl dəyməmiş bir halda unudulduğunu duyub, qəhqəhə ilə güldü.* Çəmənzəminli. *Körpüyə təpilmiş adamlardan bəzisi də balaca çamadan və ya sakvoyaj tutmuşdu.* M.Hüseyn.

**SAQA** *is. ədəb.* Nəsrlə yazılmış qədim island əsərləri.

**SAQINDIRMA** "Saqındırmaq"dan *f.is.*

**SAQINDIRMAQ** *f.* Çəkindirmək, özünü gözləməyi, qorunmağı məsləhət görmək. // Saxlamaq, çəkindirmək, bir şeydən başqasını, özünü saxlamağa çalışmaq. *Qəhrəman balaca Sabiri bəzək-düzək içərisində yaşamaqdan da saqındırmaq istəyirdi.* S.Rəhimov. *Xədicəni bu işdən saqındırmaq çox çətin olacaqdı*. S.Rəhman.

**SAQINMA** "Saqınmaq"dan *f.is.*

**SAQINMAQ** *f.* Çəkinmək, qorunmaq, özünü saxlamaq. *İçkidən saqınmaq. – Saqın, ağuludur, tök bu hərifin şərbətin, getsin.* Q.Təbrizi. *Könlümün şişəsi, saqın ki, sınar; Toxunursa ayna daşa, dayanmaz*. Aşıq Ələsgər. [Xacə Nizam:] *Saqın, aldırma ki, kor olsa cahan; Günəşin nuruna gəlməz nöqsan.* H.Cavid.

**SAQİ** *is.* [*ər.*] *klas.* Kef məclisində şərab və s. içki paylayan adam. *Bir cam yetir, saqi, bu dövran belə qalmaz; Tək bir gün olur xak ilə yeksan, belə qalmaz.* M.V.Vidadi. *Saqilər şərbət piyalələrini paylayırdılar*. M.S.Ordubadi.

**SAQİT** *sif.* [*ər.*] *köhn.* Etibardan düşmüş, qüvvədən düşmüş, qüvvəsini itirmiş; daha hökm və etibarı olmayan. *Şaban ayının 25-dən etibarən hökumətin imzası və hökumətin möhrü ilə buraxılan məktub və vəsiqələrin hamısı etibardan saqitdir*. M.S.Ordubadi. ☐ **Saqit etmək** – ləğv etmək, qüvvədən salmaq. [Məhərrəm bəy:] *Dərhal durub gəldim ki, o borcu sizə verib, atamın boynundan saqit edəm.* S.S.Axundov. **Saqit olmaq** – gücdən düşmək, hökmü qalmamaq.

**SAQQA** *is.* [*ər.*] *köhn.* Keçmişdə dalında, yaxud da araba ilə bulaqdan su daşıyan adam; suçu.

**SAQQAQUŞU** *is. zool.* Sərçəkimilər fəsiləsindən olub, başında və boynunda qırmızı və sarı tükləri olan oxuyan quş.

**SAQQAL** *is.* 1. Kişilərin üzündə və alt çənələrinin üstündə bitən tüklər. *Uzun saqqal. Saqqal qoymaq. –* [Məşədi İbad:] *Hə... Çünki mən saqqalıma həna qoyuram, elə bildim ki, sən də saçına həna qoyursan*. Ü.Hacıbəyov. [Musa:] *Saqqal yalnız üzü örtən tüklərdən ibarətdir*. S.Rəhman.

2. Bəzi heyvanların və quşların çənəsinin altından sallanan tük topası. *Keçi saqqalı*.

◊ **Saqqal ağar(t)maq** – qocalmaq. *Saqqal ağarıb, bel bükülüb, dinmə, filanı; Ovqatım olub təlx*. M.Ə.Sabir. *Ağardı saqqalı, saçı qar oldu; Sənəti sərxoşluq və qumar oldu*. S.Vurğun. **Saqqala (saqqal içinə) ağ düşmək** – b a x **saqqalı ağarmaq**. **Saqqala salam verməmək** *zar*. – saymamaq, etinasızlıq göstərmək. *Oğlan, saqqala niyə salam vermirsən?* Ə.Haqverdiyev. [İnayət:] *Xoş gördük, ay Məşədi Püstə bacı. Əlin böyüklər ətəyindədir, yenə saqqala salam vermirsən.* H.Sarabski. **Saqqala soğan doğramaq** – ələ salmaq, oynatmaq, masqaraya qoymaq. [Rüstəm Səkinəyə:] *Deməli, bu ağbirçək vaxtında saqqalıma soğan doğramaq qalmışdı, hə?* M.İbrahimov. [Əşrəf Sədəfə:] *Bacı, saqqalıma soğan doğrama*. B.Bayramov. **Saqqal-bığ basmaq** – üz-gözü tüklənmək, saqqalı-bığı uzanıb bir-birinə qarışmaq. *..Qapıdan cır-cındır içində, saqqal-bığ basmış bir adam girdi.* Çəmənzəminli. **Saqqalı çallatmaq** – b a x **saqqal ağartmaq**. [Səməndər Mixailə:] *Saqqalı çallatsan da, yaman boşboğazsan ha!* B.Bayramov. **Saqqalı ələ vermək** – başqasının təsiri altına düşmək, başqasının iradəsinə tabe olmaq, ixtiyarını başqasının əlinə vermək. **Saqqalım yoxdur, sözüm ötmür** – sözünə əhəmiyyət verilməyən, sayılmayan, dediklərinə qiymət verilməyən adamın özünə göstərilən münasibətə qarşı istehzalı cavab ifadəsi. [Salamov:] *Gördün, ağa Bahadır, nə oldu? Salamməleyküm! Saqqalım yoxdur, sözüm ötmür.* C.Cabbarlı. **Saqqalın ağarsın!** – qocal, uzun ömür sür mənasında alqış ifadəsi. **Saqqalın tökülsün!** – qarğış məqamında işlənən ifadə. [Arvad:] *A kişi, mənim üstümə arvad alırsan? A sənin saqqalın tökülsün*. Ü.Hacıbəyov. **Saqqalına dən düşmək** – qocalmağa, yaşa dolmağa başlamaq. *Qərənfilin atası Rüstəm kişi qısaboy bir adamdı. Saqqalına dən düşmüşdü*. S.Rəhman. **Saqqalında bir tük (sağ) qoymamaq** – bərk dalaşmaq, saqqalını yolmaq, saqqalının tüklərini didmək (ər haqqında). [Arvad:] *Görək, Kərbəlayı Qubad, hərgah sənin saqqalında bir tük qoysam sağ, onda bu ləçək mənə haram olsun.* Ü.Hacıbəyov. **Saqqalını (saç-saqqalını) dəyirmanda ağartmaq** – 1) çox görüb, çox işləyib böyük təcrübə qazanmaq; 2) qocaldığı

halda heç bir şey öyrənməmək. **Saqqalının ağ vaxtında** – qoca vaxtında, yaşlı çağında. [Sultan kəndlilərə:] *Balam, mən saqqalımın bu ağ vaxtında necə sizə izin verim ki, gedib quldurluq edəsiniz?* C.Məmmədquluzadə.

**SAQQALLAMA** “Saqqallamaq”dan *f.is.*

**SAQQALLAMAQ** *f. dan.* Dalaşarkən bir-birinin saqqalından yapışmaq, bir-birinin saqqalını yolmaq, dartışdırmaq; savaşmaq.

**SAQQALLANMA** “Saqqallanmaq”dan *f.is.*

**SAQQALLANMAQ** *f.* Üzünü saqqal basmaq, üzünə saqqal çıxmaq.

**SAQQALLI** *sif.* 1. Saqqalı olan, saqqal qoymuş, saqqal buraxmış. *Saqqallı kişi. – Bu dərviş ucaboylu, arğaz, uzunsaçlı və saqqallıydı.* A.Divanbəyoğlu. *Dəmirovun belə saqqallı olmağı Məmmədcanın nə isə xoşuna gəldi.* S.Rəhimov.

2. Saqqalı olan. *Saqqallı keçi.*

**SAQQALSIZ** *sif.* Saqqalı olmayan.

**SAQQIZ** *is.* Saqqızağacından sızıb çıxan, çəkildikcə uzanmaq xassəsinə malik olan ağ kitrə (adətən ağızda çeynənmək üçün istifadə edilir). *Səriyyə xanım .. ağzındakı saqqızını yavaş-yavaş çeynəyirdi.* M.S.Ordubadi. [Məşədi İbad Sənəmə:] *Buyur, bu abbasını saxla, lazım olar, saqqıza verib çeynərsən.* Ü.Hacıbəyov. *Əbil qamçını portfelinin üstünə qoyub saqqız yarmaçasının birini əlinə götürüb hazır dayandı.* Ə.Vəliyev. ☐ **Saqqız kimi yapışmaq** – bərk yapışmaq, qopmamaq, ayrılmamaq. *Palçıq saqqız kimi yapışıb möhkəm; Qopmur uzunboğaz çəkmələrindən.* B.Vahabzadə.

◊ **Saqqız çeynəmək** *məc.* – boş-boş söhbət etmək, heç bir xeyirli işlə məşğul olmamaq. [Zalxa:] *İş görməkdənsə, saqqız çeynəyirsiniz.* S.Rəhman. **Saqqız oğurluğuna getmək** – birinin yanına gedib rəyini bilməyə, fikrini öyrənməyə çalışmaq. *Qız evinə saqqız oğurluğuna getmək.* **Saqqızını oğurlamaq** – dilə tutub aldatmaq, qılığına girib özünə tərəf çəkmək, bir iş görməyə razı etmək. [Həsənağa] *Hacı Sultanın tək bircə dənə olan qızının da saqqızını oğurlamışdı.* S.Hüseyn. [Xədicə:] *Belə sözlərlə saqqızımı oğurladı, sonra da qol-qanadımı qırıb atdı bir tərəfə...* S.Rəhman. *Yad qızı hələ evə ayaq basmamış gədənin saqqızını oğurlayıb.* Mir Cəlal.

**SAQQIZAĞACI** *is. bot.* Püstə cinsindən olub meşə zolaqlarında becərilən, oduncağı möhkəm, həm də qiymətli sayılan hündür ağac; yabanı püstə. *Püstə cinsindən olan saqqızağacı da meşə zolaqlarında becərilmək üçün geniş istifadə oluna bilər. Saqqızağacı 15 metrə qədər hündürlükdə, qışda yarpağı tökülən ağacdır. Meyvəsi yeyilmir, oduncağı möhkəmdir və qiymətli hesab olunur.* H.Qədirov.

**SAL**[1] *is.* Plitə şəklində iri, bütöv yastı daş parçası. *Həyatinə sal daşı döşənmiş ev iki kəllə, bir orta otaqdan ibarətdir.* Ə.Vəliyev. *Kim isə lap qədim zamanda bulağın ətrafını daş ilə hördürmüş, qabağına içi yonulmuş iri bir sal qoydurmuş, əmələ gələn kiçik hovuza novça qayırtdırmışdı.* Ə.Sadıq. // *Sif. mənasında.* İri, bütöv. *Sal buz. – Ətrafi boz daşdan uca bir hasar; Üstü sal dəmirli qalın qapılar.* H.K.Sanılı. *Mehmanxanada ilk nəzərə dəyən birinci mərtəbədəki böyük dairəvi dəhlizin bir neçə yerdən şırım-şırım çatlamış sal şüşəsidir.* M.İbrahimov. [Səfərin] *cavanlıq vaxtında .. ağ sal daşlara vurduğu tişənin ahəngdar səsi gecə də qulağından getməzdi.* Mir Cəlal. // *Sif. mənasında.* Lay, təbəqə şəklində olan. *Hər bir yay fəsli küçələrdə, arabalarda buz sallarını görəndə .. o buzu şampanskilərə və ləzzətli marojnalara işlədən xoşbəxtlər gözümün qabağına gəlir.* C.Məmmədquluzadə. *Bu zaman göy qübbəsi sal dəmirə dönür.* S.Rəhimov.

**SAL**[2] *is.* Üzərində suda üzmək, şey daşımaq və ya bir sahildən o biri sahilə keçmək üçün bir və ya bir neçə sıra bir-birinə bağlanmış şalbanlardan ibarət nəqliyyat vasitəsi. *Uğuldayır uzaqda – o tayda toplar; Sal üstündə üzürəm o taya mən də.* Ə.Cəmil. *Salın üstündəkilərdən kim isə su üzərindəki səyahətdən nəşələnərək bir ağız bayatı çağırdı.* Ə.Sadıq.

**SALAKA** *is.* [*rus.*] Balıq növü.

**SALAM** *is.* [*ər.*] Görüşərkən bir-birinə sülh və əmin-amanlıq diləmək ifadəsi. ☐ **Salam e(y)ləmək** *klas.* – salamlamaq, salamını yetirmək. [Qərib:] *Məndən Şahsənəmə sən salam elə; Gəlməsə dağıdaram bağı, Ağcaqız.* “Aşıq Qərib”. *Harda gördün, ona salam eylə; Baş əyib qultək, ehtiram eylə.* S.Ə.Şirvani.

**Salam göndərmək** – birisi ilə və ya məktub vasitəsilə uzaqda olan bir şəxsə öz dostluq hisslərini bildirmək. **Salam vermək** – biri ilə görüşərkən "salam" deyib təbrik etmək. *Əsgər daxil olub, salam verir.* Ü.Hacıbəyov. **Salam(ını) almaq** – salama salam ilə cavab vermək. [Dərviş:] *Salamımı bir qoca ağsaqqal kişi aldı.* A.Divanbəyoğlu. *Lətifə* [Tahirin] *salamını aldı, nə üçün belə gec gəldiklərini soruşdu.* M.Hüseyn. // **Salam** – görüşərkən təbrik sözü kimi işlənir. *Salam, yoldaşlar! Salam, əziz vətəndaşlar!*

◊ **Salam atəşi** – b a x **salyut**. *Salam atəşləri isə o qədər də çox ara vermir, bir də uğuldayaraq yeri-göyü titrədirdi.* M.Hüseyn. **Salama durmaq** – hörmət əlaməti olaraq ayaq üstə dayanıb durmaq. [İdris] *..Hərbi salama durub, hadisə haqqında qısa raport verdi.* Ə.Məmmədxanlı.

**SALAMAT** *sif.* və *zərf* [*ər.*] 1. Sağ, diri, xətərsiz-bəlasız, sağ-salamat. [Qurban:] *Sonra yaz ki, mən də, şükür Allaha, sağ və salamatam.* A.Şaiq. [Qəndab:] *Məzahiri tapıb salamat olduğunu bildim.* B.Bayramov. ☐ **Salamat çıxmaq** – sağ qalmaq, diri qalmaq, ölməmək; salamat qurtarmaq. [İlyasın dayısı:] *Tərlan olmasaydı, mən o axırıncı döyüşdən salamat çıxmayacaqdım.* Ə.Məmmədxanlı. **Salamat qalmaq** – 1) ölməmək, sağ qalmaq, yaşamaq, xilas olmaq, xətərdən qurtarmaq. *Bir müddət sonra isə Kərimxanın salamat qalan yoldaşları* [Xavərə] *əl tutmağa başlamışdı.* M.İbrahimov; 2) bütöv qalmaq, sağ qalmaq, toxunulmaz qalmaq; zədəsiz, nöqsansız olmaq, dağılmamaq. *Çox çəkmədi ki, gəlinlər gəlib* [şairin] *daxmasını suvardılar və kəndin salamat qalmış* (f.sif.) *yeganə çırağını da* [şairə] *bağışladılar.* Ə.Məmmədxanlı. **Salamat qurtarmaq** – b a x **salamat qalmaq** 1-ci mənada. *Hələ bu vaxta kimi bir adam onun əlindən salamat qurtarmayıb.* "Koroğlu". *Odların içinə düşür, çox zaman; Salamat qurtarır ölməz qəhrəman.* M.Rahim. *Uşaq salamat qurtaranda elə bil dünya bizim olub.* Mir Cəlal.

2. *məc.* Sağlam, gümrah. *O, sifəti qaraşın, hündür və salamat bir arvad idi.* C.Məmmədquluzadə.

◊ **Salamat qalın!** – görüşüb ayrılarkən qalan adama (adamlara) deyilən əlvida ifadəsi. *Bəlkə bu yerlərə bir də gəlmədim; Duman, salamat qal, dağ, salamat qal.* M.Araz. **Salamat yer qalmamaq** – hər yeri, hər tərəfi zədələnmək, yaralanmaq. *Şahnigar taqətdən düşmüşdü. Ayaqqabısının dabanı qopmuş, əynindəki paltar didik-didik olmuşdu. Bədənində salamat yer qalmamışdı.* İ.Şıxlı. **Salamat yer qoymamaq** – hər yerini, hər tərəfini əzişdirmək, zədələmək, yaralamaq, yaxud dağıtmaq, korlamaq, bərbad hala salmaq. [Məhbusi:] *Yavaş, Kərimxan, qardaşım, yavaş. Bişərəflər məndə salamat yer qoymadılar.* M.İbrahimov.

**SALAMATİ** *is.* [*ər.*] *din.* Səfərə çıxarkən salamat gedib-gəlmək üçün yoxsullara verilən nəzir; salamatlıq.

**SALAMATLAŞMA** "Salamatlaşmaq"dan *f.is.*

**SALAMATLAŞMAQ** *f.* Görüşüb ayrılarkən (bir-birinə) əl verərək sağollaşmaq, xudahafizləşmək. *Bahadır salamatlaşıb troykaya əyləşdi.* N.Nərimanov. *Camaat hamısı durub Rəşid ilə salamatlaşdı.* İ.Musabəyov. [Laçın:] *Mən salamatlaşıb, əsgərlərin yanına qayıtdım.* H.Nəzərli.

**SALAMATLIQ** *is.* 1. Sağlıq, sağ-salamatlıq, ölüm-itim olmama. [Qoca ceyrana:] *Qaç! İnsandan uzaq olmaq salamatlıqdır.* Çəmənzəminli. [Şərəfoğlu Rüstəmə:] *Otur görək, deməli, evdə salamatlıqdır.* M.İbrahimov. // Əmin-amanlıq, sakitlik, dinclik. *Hər yerdə salamatlıqdır. Təki salamatlıq olsun, hər şey düzələr.*

2. B a x **salamati**.

**SALAM-DUA** b a x **salam**. *Yar yarın özün istər; Salam-duanı neylər?* (Bayatı). [Nurəddin Cəfərə:] *Məndən Bahara salam-dua yetir.* S.S.Axundov.

**SALAMƏLEYKÜM**[1], **SALAMÜNƏLEYKÜM** b a x **salam**. [Cümşüd bəy:] *Salaməleyküm, qonşu, nə kefdəsən.* E.Sultanov. [Hüseynqulu bəy:] *Məşədi İbad, salamünəleyküm, a kişi, bu nə işdir, eşitdim ki, qızın iki adaxlısı vardır.* Ü.Hacıbəyov.

**SALAMƏLEYKÜM**[2] *is. bot.* Bataqlıqlarda, rütubətli yerlərdə, bəzən alaq kimi əkinlərdə bitən bir bitkinin adı. *Salaməleyküm cinsinin*

*nümunələri bataqlıqlarda, rütubətli yerlərdə, bəzən alaq kimi əkinlərdə yayılan çoxillik və ya birillik bitkilərdir.* H.Qədirov.

**SALAM-KALAM** [*ər.*] b a x **salam**. *Salam-kalamdan sonra Pəri xanım soruşdu.* "Abbas və Gülgəz".

◊ **Salam-kalamı olmaq** – tanışlığı olmaq, yaxınlığı olmaq. [Kişi:] *Mənim lap çoxdan onunla salam-kalamım var.* S.Rəhman.

**SALAMLAMA** "Salamlamaq"dan *f.is.*

**SALAMLAMAQ** *f.* 1. Salam vermək, salamla qarşılamaq. *Ağsaqqal qocalar qatran çubuqlarını dodaqlarından çəkib, qorxaq nəzərlərlə bizi salamladılar.* H.Nəzərli.

2. *məc. tənt.* Təbrik etmək, alqışlamaq. *Günəş qızıl şüaları ilə sanki azadlığa çıxan adamları salamlayırdı.* S.Vəliyev.

**SALAMLAŞMA** "Salamlaşmaq"dan *f.is.*

**SALAMLAŞMAQ** *qarş. f.* Bir-birinə salam vermək. *Qoca, əmim oğlu ilə görüşdü, salamlaşdı.* S.S.Axundov. // Məc. mənada. *Onlar salamlaşır aydın səhərlə; Dönürlər geriyə şən nağmələrlə.* M.Rahim.

**SALAMSIZ-KALAMSIZ** *zərf* Salam vermədən, salamlaşmadan; dinmədən, danışmadan. *Qələmi mürəkkəbə batırdım. Salamsız-kalamsız başladım.* Mir Cəlal.

**SALAT[1]** [*ər.*] Dəfn günü vəfat edənin evinin üstündə uca səslə oxunan minacat. ☐ **Salat çəkmək** – vəfat edənin evinin üstündə uca səslə minacat oxumaq. *Bir küçənin içərisində dörd qapının önündə "tabut" qoyulmuş, dörd damda salat çəkilirdi.* S.Hüseyn.

**SALAT[2]** [*rus.*] Tərəvəz, yumurta, bəzən ət və s. doğranaraq üstünə zeytun yağı, xama və s. tökülərək hazırlanan soyuq yemək. [Səriyyə] *stolu bayıra çıxararaq, üstünə salat, göy-göyərti, çəngəl-bıçaq qoydu.* İ.Əfəndiyev.

**SALAVAT** *is.* [*ər.*] *din.* Məhəmməd peyğəmbər və imamların şəninə oxunan dua. *Hamının gözü salavat səsi gələn tərəfə baxırdı.* M.S.Ordubadi. *Salavat səsindən qulaq tutulurdu.* E.Sultanov. ☐ **Salavat çəkmək (çevirmək, göndərmək, çöndərmək)** – dua oxunduqdan sonra sağ əli üzə çəkmə ayini. *Bu hində yuxudan oyanıb öz-özümə bir neçə dəfə salavat çöndərdim.* C.Məmmədquluzadə. *Ziyafət məclisindəkilər bir səslə peyğəmbərə salavat göndərdilər.* M.S.Ordubadi. *Mahmud əmi duanın arasında "allahüməssəlli" deyib, salavat çevirdi.* B.Talıblı.

**SALÇI** *is.* 1. Sal düzəldən usta.

2. Bərəçi.

**SALDIRMA** "Saldırmaq"dan *f.is.*

**SALDIRMAQ** *f.* 1. Salmağa məcbur etmək. *Molla tülkünün dalınca nə qədər qaçırsa, toyuğu saldıra bilmir.* "M.N.lətif."

2. İki və ya bir neçə adamı, yaxud heyvanı qızışdırıb bir-birinin üstünə hücum etdirmək, salışdırmaq. [Müşavir:] *Min zəhmətlə bunları bir-birinə saldırmışıq.* P.Makulu.

3. Tikdirmək, bina etdirmək, düzəltdirmək. *..Bir neçə mərdümazar adamlar məscid bağında istəyirlər, bir imarət saldırsınlar və orada bir məktəb açsınlar.* C.Məmmədquluzadə. [Cənnətəli ağa:] *Oranı mən, orada olanda istəyirdim bağ saldıram.* N.Vəzirov.

4. Döşətmək, yerə sərdirmək. *Evə palaz saldırmaq. – Molla İrandan gəbələr aldırmış; Otağına, eyvanına saldırmış.* A.Səhhət.

5. *məc. dan.* Qənaət edərək yığmaq, toplamaq; dala atmaq. *Maaşdan bir az saldırmaq. – Hacı Rüstəm burada da çalışırdı ki, bir neçə şahı, heç olmasa bir neçə qəpik saldırsın.* Ə.Haqverdiyev.

6. Qoydurmaq. *Dalına banka saldırmaq. Zəli saldırmaq.* – [Gəldiyev:] "*Soyuqlamışam*" – *deyə neçə dəfə küpə saldırdı.* Mir Cəlal.

**SÁLDO** [*ital.*] Mühasibatda: mədaxil ilə məxaric (debet ilə kredit) arasında olan fərq, qalıq.

**SALEH** *sif.* [*ər.*] *köhn.* 1. Yararlı. *Dedim: saxla məni, qul olum sənə; Qardaş yox, saleh oğul olum sənə.* A.Səhhət.

2. İxtiyarı olan. *Saleh mindi qara nər; Süsən, sünbül, qaranər; Doğsa günəş camalın; Şah dağından qar ənər.* (Bayatı).

3. Dinin əmrlərinə uyğun hərəkət edən. *Əməlləri saleh olmayanları; Orda özün kimi üryan görərsən; Qaynar tiyanlarda büryan görərsən.* M.Müşfiq.

**SALFÉT** [*ital.* salvietta] Yeməkdən sonra ağzı və əli silmək üçün parçadan tikilmiş dördkünc dəsmal. *Ənvər bıçağı, salfetləri götürüb geri qayıtdı.* Ə.Vəliyev. *Nəzakət xanım əlində ağ salfetə bükülmüş qab gəlir.* İ.Əfəndiyev. // Bu formada yumşaq ağ və ya bəzəkli kağız parçası. *İki paçka salfet almaq.*

**SALĞAR** *is. məh.* Qayda, üsul.

**SALXIM** *is.* Üzüm gilələrinin bir budaqcıqdakı topası. *Şanı salxımı. Sarıgilə salxımı. – Üzüm salxımları budaqlardan sallanaraq ağacları yolka kimi bəzəyir...* S.S.Axundov. *Cabbar içəri girən kimi, Çimnaz süfrədə qalan... üzüm salxımını götürüb ona uzatdı.* Ə.Əbülhəsən. // Bu şəkildə olan hər hansı şey. *Arı salxımı. Buz salxımı. – Nə olar, bircə salxım yasəmən üz, ver mənə! Əllərinin gül ətri qarışsın yasəmənə.* R.Rza. *Bayaqdan bəri əncir-üzüm yeyib püstə salxımlarına gözaltı baxan ovçu dostum qəti olmayan bir hərəkətlə bir salxım püstə götürdü.* M.Rzaquluzadə.

**salxım-salxım** *zərf* Salxım kimi, salxımlar şəklində. *Buz salxım-salxım sallanıb. – Yasəmənin gülləri salxım-salxım olub sallanırdı.* İ.Əfəndiyev. [Çimnaz] *indi bir tovuz kimi əlvan boyalarla bərq vurur, ..qızıl gərdənbəndlər, mirvari boyunbağılar boynundan salxım-salxım aşağı sallanırdı.* Ə.Məmmədxanlı.

**SALXIMABƏNZƏR, SALXIMVARİ** *sif.* Salxım kimi, salxıma oxşayan, salxım şəklində olan. *Salxımvari çiçəklər.*

**SALXIMÇİÇƏK(Lİ)** *sif.* Çiçəkləri salxıma oxşayan, salxım kimi sallanan. *Salxımçiçək bitki.*

**SALXIMLANMA** "Salxımlanmaq"dan *f.is.*

**SALXIMLANMAQ** *f.* Salxım şəklinə düşmək. [İbrahim Xəlilin] *yetişdirdiyi bağda almalar qızarır, heyvalar saralır, bal şəhdli üzümlər salxımlanıb sallanırdı.* S.Rəhimov. *Ümidlə Bahar .. salxımlanıb tökülən cökə ağaclarının altı ilə yan-yana gedirdilər.* B.Bayramov.

**SALXIMLI** *sif.* Salxımı olan, salxıma oxşar çiçəkləri olan. *Kökü sudan ayrılmayan söyüd ağacları sıx və salxımlı budaqları yolun sağ-soluna sallayır.* Mir Cəlal.

**SALI** *is.* Həftənin ikinci günü, çərşənbə axşamı, tək günü.

**SALIQ** *is.* Xəbər, soraq, bildirmə. *Ardınca verdim salıq; Tükəndi səbrim artıq; Ey işıqlı dövr, gəl.* M.Müşfiq. [Səməd:] *Ağacın yerini sənə dədəm salıq verdi.* İ.Hüseynov.

**SALIQÇI** *is.* Bələdçi.

**SALIM: bir salım** – az, azacıq; bir dəfə tökməyə, salmağa çatar. *Bir salım çay. Bir salım ədvə. – O, düşəndə qonşusuna bir salım duz, yarım sərnic ayran verib savaba çatar.* S.Rəhimov.

**SALIMLIQ** b a x **salım**.

**SALINMA** "Salınmaq"dan *f.is.*

**SALINMAQ** "Salmaq"dan *məch. Yerə palaz salınmaq. Örtü salınmaq. Süfrə salınmaq. – Eyvaz ocağın kənarına salınmış* (f.sif.) *keçənin üstündə əyləşmiş*(*di*).. İ.Əfəndiyev.

**SALIŞDIRMA** "Salışdırmaq"dan *f.is.*

**SALIŞDIRMAQ** *f.* İki tərəfi bir-birilə düşmən etmək, vuruşdurmaq, bir-birinin üzərinə saldırmaq, təhrik etmək.

**SALİM** *sif.* [*ər.*] *klas.* 1. Salamat. *Tək-tək ayılan varsa da, haqq dadıma çatsın; Mən salim olum, cümlə cahan batsa da batsın.* M.Ə.Sabir.

2. Dinc, sakit, əmin. *Başmaqçı usta Ağabala .. saleh, salim, mömin, Allah bəndəsi bir şəxs idi.* Çəmənzəminli.

**SALLABAŞ** *sif.* 1. Başı əsən, daim aşağı sallanan. *Sallabaş adam.*

2. *məc.* Mızı, adamın üzünə baxmayan, qəlbiqara.

**SALLABIĞ** b a x **sallaqbığ(lı)**. *Sallabığ kişi.*

**SALLAĞI** *zərf* Sallanmış halda, bir tərəfə əyilmiş vəziyyətdə, çöməlmiş halda. [Arvad] *..uzun müddət sallağı oturmaq üçün şalı belinə bərk dolamışdı.* H.Seyidbəyli.

**SALLAQ**[1] *is.* [*ər.*] Mal-heyvan kəsən, sallaqxana fəhləsi.

**SALLAQ**[2] *sif.* Sallanmış halda olan, sallanan, aşağıya tərəf uzanmış, ya bükülmüş. *Tazının başı tülkü başı kimi uzun, qulaqları sallaq olardı.* H.Sarabski. *Dən düşmüş saqqalı, sallaq bığları; Göstərir yaşını qırxdan yuxarı.* H.K.Sanılı. *Kərim baba iri sallaq dodaqlarını geniş-geniş açaraq gözlərini daha da qıydı.* A.Şaiq. // Asılı, asılı vəziyyətdə. [Qədir] *bir əlilə qundaqdan, o biri əli ilə də tüfəngin qolundan tutub, sallaq bir vəziyyətdə saxlayır, gəzinirdi.* Mir Cəlal.

**SALLAQBIĞ(LI)** *sif.* Bığları sallaq olan. *Sallaqbığ kişi. – Yaqubun böyründəki ağ kürklü, sallaqbığ, arıq kəndli qeyri-ixtiyari donqar hülqumunu qaldırıb saldı.* M.Hüseyn. *Sallaqbığlı qoca faytonçu belini düzəltdi və nədənsə şikayətlənərək yerə endi.* Q.İlkin.

**SALLAQDODAQ(LI)** *sif.* Uzun və sallaq dodaqları olan. *Sallaqdodaq uşaq.*

**SALLAQXANA** *is.* [*ər.* sallaq və *fars.* ...xanə] 1. Mal-heyvan kəsilmək üçün xüsusi bina, yer. *Sallaqxana sexi. – İt sallaqxanadan bir sümük aparar, öz ayağını kəsər.* (Ata. sözü). [Qulu] *son zamanlar qardaşını dükanda buraxıb, özü sallaqxananı icarəyə götürmüşdü.* A.Şaiq.

2. *məc.* Qırğın yeri, kütləvi qırğın, çoxlu adam öldürülən yer. *Kazakxana həqiqi bir sallaqxanaya dönmüşdü.* P.Makulu. ◻ **Sallaqxanaya göndərmək** *məc.* – ölümə, qırğına göndərmək.

**SALLAQQARIN(LI)** *sif.* Qarnı yekə və sallanmış kimi olan. *Sallaqqarın adam.*

**SALLAQQULAQ(LI)** *sif.* 1. Uzun və sallaq qulaqları olan (heyvanlar haqqında).

2. *məc. dan.* Qeyrətsiz, heysiyyətsiz, öz hörmətini saxlamayan. *Sallaqqulaq adam.*

**SALLAQLIQ**[1] *is.* Sallağın işi, peşəsi; mal-heyvan kəsmə peşəsi. *Sallaqlıq etmək. – Kişinin əlindən yaxşı sallaqlıq da gəlirmiş!* "Kirpi".

**SALLAQLIQ**[2] *is.* Sallaq şeyin halı; sallanmış halda olma.

**SALLAMA** 1. "Sallamaq"dan *f.is.*

2. *zərf* Bir ucunu aşağı salladaraq, uzadaraq. *Belbağını sallama bağlamaq. Kəlağayını sallama örtmək. – Zərnigar xanım uzun donunun ətəyi ilə gözlərini silə-silə Şamxalın arxasınca cığıra düşdü və oğlunun enli kürəyinə yapışmış tərli köynəyinə, belindəki sallama kəmərinə .. baxdı.* İ.Şıxlı.

3. Bax **çobanbayatısı**. [Cəbi:] *İndi sən bir sallama bayatı çal, gör mən necə oyadıram.* S.S.Axundov.

4. Sırğadan, çilçıraqdan və s.-dən bəzək kimi sallanan hissəciklər. *Sallama sırğa taxmaq. Sallama çilçıraq.*

**SALLAMAQ** *f.* 1. Bir şeyi üzüaşağı tutmaq, uzatmaq, sallaq vəziyyətdə saxlamaq, ucunu aşağı endirmək; asmaq. *Xalçanı balkondan sallamaq. Həyətə ip sallamaq. – Yenə böyük oğlan qabağa yeriyib dedi ki, gərək* [quyuya] *məni sallayasınız.* Çəmənzəminli. [Səməd] *yoldaşlarına üz tutub, borulardan birini şaquli vəziyyətdə suya sallamağı xahiş eləyir.* M.Hüseyn.

2. Aşağı əymək, sallaq vəziyyət vermək. *Qurd quyruğunu sallayıb, dərənin bir o başına gedib, bir də dönüb gəlir.* A.Şaiq. *Başını sallayır şamlar, qovaqlar; Dillənib bir nəğmə ötür budaqlar.* M.Rahim.

3. *məc. dan.* Qaşqabağını tökmək, üzünü turşutmaq, dinib-danışmamaq. *Nə sallamısan? – Mənim malıma mallanırsan; Məni görəndə sallanırsan.* (Ata. sözü).

4. Bir sıra sözlərin yanına gətirilərək, müxtəlif ifadələr və mürəkkəb feillər düzəldilir; məs.: qaşqabağını sallamaq, qarın sallamaq, damağını sallamaq və s.

**SALLANA-SALLANA** *zərf* 1. Əzilə-əzilə, nazlana-nazlana, nazla. *Sallana-sallana gedən Salatın! Gəl belə sallanma, göz dəyər sənə.* Qurbani. *Qərq olsun yaşıla, ala gəlsin; Naz ilə sallana-sallana gəlsin.* Q.Zakir. *Sallana-sallana gedən Salatın; O sərxoş yerişin yola yaraşır.* Aşıq Ələsgər.

2. Yırğalana-yırğalana, yan basa-basa. *Maşın uzaqlaşır, karvan sallana-sallana hərəkət edib gedirdi.* M.İbrahimov.

**SALLANIŞ** *is.* Yeriş tərzi, nazla, əzilə-əzilə yerimə. *Oturuşun gözəl, duruşun gözəl; Sallanışın gözəl, yerişin gözəl.* M.P.Vaqif. *Gözəllər sultanı, ay Səlbixanım; Sallanışın bir mahala əvəzdir.* Aşıq Ələsgər.

**SALLANMA** "Sallanmaq"dan *f.is.*

**SALLANMAQ** *f.* 1. Üzüaşağı sallaq vəziyyətdə asılmaq. *Stolun üstündəki göy mahud örtük yanlardan xeyli aşağı sallanmışdı.* M.Hüseyn. *Qarmaqdan çoxlu qiymətli şeylər sallanırdı.* Mir Cəlal.

2. *məc.* Nazla, əda ilə yerimək. *Geyinib sallanan gözəllər çoxdu; Tərlan kimi süzmək ona yaraşır.* "Koroğlu". *Yarım sallanıban gələndə bizə; Düşübən əl-ayağından öpəydim.* M.P.Vaqif. ◻ **Sallanıb getmək (keçmək)** – üz tutub getmək. *Həkim başmağının dalını daşa vurub taqqıldada-taqqıldada .. bazaraşağı sallanıb getdi.* Çəmənzəminli. *Dedim öldür məni, sallanıb keçdi; Süzgün baxışları qəlbimi deşdi.* H.Cavid.

3. *məc.* Sallanan, enən kimi görünmək. *Göydən qara, zəhmli buludlar sallanmışdı.* Çəmənzəminli. *Gün əyilmiş, kölgələr sallanmışdı.* Mir Cəlal.

**SALLAŞMA** "Sallaşma"dan *f.is.*

**SALLAŞMAQ** b a x **sallanmaq** (çoxları haqqında). *Tələbələr yenə dartındılar, qadın da onların ətəyindən tutub sallaşdı*. Çəmənzəminli.

**SALLATMA** "Sallatmaq"dan *f.is.*

**SALLATMAQ** b a x **sallamaq**.

**SALMA**[1] "Salmaq"dan *f.is.*

**SALMA**[2]**: salma çay** – şirin çay. [Qulu:] *Yəni altı-yeddi stəkan salma çay içdiyini də yalan deyirəm?* S.S.Axundov.

**SALMAQ** *f.* 1. Bir şeyi hündür yerdən aşağı atmaq, tullamaq, buraxmaq, düşürmək. *Asta qanad çalın, qafil telləri; Heyfdir, salarsız düzə, durnalar!* M.P.Vaqif. *Mən də bombaları salanda kəndə; Dedim: "Əl atmasa həkim bıçağa; Xəstə şəfa tapıb durmaz ayağa"*. M.Rahim.

2. Əlindən buraxmaq, düşürmək. *Qabı salmaq. Qutunu salmaq. Boşqabı salıb sındırmaq. – Qız* [müəllimi] *görüncə şaşırıb üzünü örtməyə tələsdikdə səhəngini salıb qırmışdı*. S.Hüseyn.

3. Özü bilmədən bir şeyi düşürüb itirmək. *Açarı bilmirəm harada salmışam.*

4. Əsasını qoymaq, təsis etmək, qurmaq, düzəltmək. *Mədən salmaq. – ..Haman yerdə dam-daş tikdirib, bir balaca kənd salıblar*. C.Məmmədquluzadə. *Fəhlə qardaş, nə tikilir bu qum çölündə? Qəribmisən, nəsən, oğul? Şəhər salırıq*. Ə.Cəmil.

5. Tikmək, qurmaq, qayırmaq, düzəltmək. *Yol salmaq. Bənd salmaq. – Çayların üstündən buz körpü saldı; Seyrəldi get-gedə gediş-gəliş də*. S.Vurğun.

6. Keçirmək, taxmaq. *Əmniyyə açarı qapıya saldı*. M.İbrahimov. *Gəldiyev əlindəki kibrit çöpünü nəm çəkmiş zərflərin böyründən salır, bura-bura açırdı*. Mir Cəlal. *..Belindən qayışını açıb bir ucunu onun buynuzuna ilmək kimi salıb çəkdi*. M.Rzaquluzadə.

7. Örtmək. *Üstünə yorğan salmaq. Başına şal salmaq. – Əvəz kişi çuxasını çiyninə salaraq qapını örtmək üçün getdi*. Ə.Vəliyev. [Minayə] *başına saldığı ağ torda çox yaraşıqlı görünürdü*. Ə.Əbülhəsən. [Axund] *qara gecə ləbbadəsini ehmalca çiyninə salıb, dəhlizə çıxdı*. Mir Cəlal.

8. Tez-tələsik oturmaq, özünü yerləşdirmək. *Özünü divanın üstünə salmaq. Özünü boşalmış yerə salmaq*. // Tez-tələsik girmək; yetmək, çatmaq, özünü çatdırmaq. *Ruqiyyə durub alaçığa qaçdı, orada şarpadan yıxıldı. Qoca kişi də, qarı da oraya yüyürdülər. Mən də özümü oraya saldım*. A.Divanbəyoğlu. *Yoldaşlarım .. özlərini mənim yanıma saldılar*. Mir Cəlal.

9. Yerinə oturtmaq, keçirmək, geydirmək. *Çıxığı salmaq. Stulun qıçını yerinə salmaq. – ..Faytonumun çarxı oxdan çıxdı, onu salıncan mən istədim ki, sizdə bir az qızınıb rahat olam*. S.S.Axundov.

10. Yatağına qoymaq, yerləşdirmək, rahatlamaq. *Əynində ağ xalat olan təmiz geyimli, yaşlı arvad uşağı alıb yerinə saldı*. M.İbrahimov. *Gilə qucağındakı körpəni yerinə salıb ayağa qalxdı*. Ə.Vəliyev.

11. Tez yollamaq, dərhal göndərmək. *Mən aşıq bu çağlara; Bülbül qonub bağlara; Qayıtmasan bərəyə; Ovçu sallam dağlara.* (Bayatı). *Nəbi Əsədi öldürəndən sonra kəndlərə adam saldı ki, mən Əsədə olan borcu vermişəm. Tay siz borc verməyəcəksiniz*. "Qaçaq Nəbi".

12. Döşəmək, sərmək. *Yeşiklərə kağız salmaq. Evlərə palaz salmaq*. – [Hacı Həsən:] *Adə Heydər! Durma tez evə xəbər elə ki, otlaqlara fərş salsınlar, qonaq gələcək*. C.Məmmədquluzadə. *Atam altına balaca döşəkçə salmış, bardaş quraraq arxasını balışa söykəmişdi*. M.İbrahimov. *Göyçək bacı sevincək halda eyvana naxışlı bir keçə saldı*. Ə.Vəliyev.

13. Bir şeylə örtmək, qapamaq; aşağı endirmək. *Ağca xanım qapının rəzəsini vurdu, pərdəsini saldı*. Mir Cəlal.

14. Qoymaq. *Xəstəyə banka salmaq. Boğazına zəli salmaq. – Kərimin ayağına yağlı xəmir salıb yerə uzatdılar*. H.Sarabski.

15. Ağac və s. göyərti əkmək. *Bağ salmaq. Meşə salmaq. – .. Arvad-uşaq kiçik bostan salıb şaxa çıxan lobya, soğan əkirdilər*. Ə.Əbülhəsən. *..Bizim məktəb kənddə gözəl bir meyvə bağı salmışdır*. M.Rzaquluzadə.

16. Yaymaq, yerləşdirmək. [Molla] *baxır ki, halvaçı təzəcə halvanı tiyandan çıxarıb, salır tabaqlara*. "M.N.lətif."

17. Tökmək. *Samovara kömür salmaq. Xörəyə duz salmaq. – Noxudu bozbaşa salanda aşpazı qoyub axund ilə məsləhət eləyirik.*

C.Məmmədquluzadə. // Batırmaq (mayedə). [Dərviş:] *Bir dua yazacağam, onu suya salıb verərsiz oğlana..* N.Vəzirov. *Mollayev təzəcə gətirilmiş çaya limon saldı.* M.Hüseyn.

18. İçəri buraxmaq, daxil etmək. *Heydərəli oğlanı içəri salıb, yenə o biri otağa çəkildi.* M.Hüseyn. *Sürmə xala Əzizi hamamxanaya salıb mətbəxə qayıtdı və tələsik yemək hazırlamağa başladı.* S.Rəhman.

19. Tikmək, naxışlamaq. *Dəsmala gül salmaq. Divara naxış salmaq. – Axşamüstü Şəfiqə küçəyə baxan pəncərənin qırağında oturub, yaylığına haşiyə salırdı.* H.Seyidbəyli.

20. *məc.* Yoluxdurmaq, yaymaq. *Xəstəlik salmaq.*

21. *məc.* Tutmaq, həbs etmək. *Həbsə salmaq. Dama salmaq.* – [İzzəddin:] *Şah bizi istəsə zindana salar.* M.Rahim.

22. Devirmək, yıxmaq, taxtdan düşürmək. *Hakimiyyətdən salmaq. Padşahı taxtdan saldılar.*

23. Bir sıra isimlərə qoşularaq müxtəlif ifadə və mürəkkəb feillər əmələ gətirir; məs.: məhəbbətini salmaq, könlünü salmaq, ələ salmaq, araya salmaq və i.a.

**SALMONELLYOZ** *is. tib.* İnsan və heyvanlarda kəskin infeksion xəstəlik.

**SALNAMƏ** *is.* [*fars.*] İl ərzində bir yerdə baş verən tarixi hadisələri qeydə alan kitab və s. // Hadisələrin hər il qeydə alınması; gündəlik, xronika və s. həyat salnaməsi. [Mirzə Ələkbər Sabirin] *şeirləri yarandıqları zamanın ən doğru bədii sənədləri, XX əsrin əvvəlinin salnaməsidir.*

**SALNAMƏÇİ** *is.* Salnamə yazan şəxs.

**SALÓL** *əcz.* Bağırsaqları və sidik yollarını dezinfeksiya etmək üçün ağ rəngli kristallik maddə (dərman).

**SALÓN** [*fr.*] 1. Qonaqlar üçün qəbul otağı. [Firəng səyyahı:] *Bizi neçə otaqdan keçirib bir salonda əyləşdirdilər.* Ə.Haqverdiyev.

2. Zal. *Məhkəmə salonu çadralı və çadrasız qadınlarla dolu idi.* T.Ş.Simurq. *Alqış səsləri salonu bürüdü.* M.Hüseyn.

3. Bərbərxanalarda: kişi, qadın və uşaqlara xidmət etmək üçün ayrılmış xüsusi otaq. *Kişi salonu. Qadın salonu.*

4. Bədii şeylər və incəsənət əsərləri satılan mağaza.

5. Avtomobillərin, avtobusların, trolleybusların və s.-nin sərnişinlərin oturduğu iç hissəsi.

**SÁLTO** *is.* [*ital.*] Akrobatika və idman gimnastikasında xüsusi hərəkət növü; mayallaq, mayallaq aşma.

**SÁLTUS** *is.* [*lat.*] Qədim Romada xüsusi şəxslərə icarəyə verilən meşə, otlaq və s. torpaq sahələri.

**SALURLAR** *is.* Oğuzların 24 tayfasından biri.

**SALYÚT** [*fr.* salut – salamlama] Şanlı bir hadisə, yaxud görkəmli bir şəxsin şərəfinə hörmət əlaməti olaraq tüfəngdən və ya topdan atəş açmaq, əlvan fişənglər buraxmaq, bayraq qaldırıb endirmək (gəmidə) və s. ilə icra edilən təntənəli salam rəmzi. *Tankerdən yüksələn sirena səsi adanın ilk sakinlərinə salyut verdi.* M.Hüseyn.

**SAM, SAM YELİ** bax **səmum**. *Bəlkə bu gəlişdən sonra qızın həyat çəməninə sam yeli əsməyəcək, ..xüsusən Hidayətə açılması müşkül olan dərdi daha qövr etməyəcəkdi?* B.Bayramov.

**SAMÁN** *is.* Taxıl döyüldükdən və təmizləndikdən sonra qalan çöpşəkilli hissəciklər, xırda-xırda doğranmış küləş. *Saman sənin deyil, samanlıq ki sənindir.* (Ata. sözü). *Qorxurdular ki, atlarımız üçün arpa, saman, özümüz üçün yemək alıb, parasını verməyəcəyik.* H.Nəzərli. *Calal .. saman tayasının arasında .. mağarayabənzər daldalıq bir yer düzəltmişdi.* S.Vəliyev.

◊ **Saman altından su yeritmək** – əl altından iş görmək, gizli-gizli iş görüb üzə vurmamaq, ara qarışdırmaq. *Bu hərif Nikolay zamanı küçə vəkili idi, saman altından su yeridən idi..* E.Sultanov. [Səkinə Rüstəmə:] *Yuxuma qara-qura gətirən .. saman altdan su yeridən Yastı Salmandır, bu qara əcinnələrdir.* M.İbrahimov. **Saman kimi** – həddindən artıq çoxlu şey haqqında. [Rüstəm bəy qızına:] *Sənin üçün bir ər tapmışam ki, bir ər tapmışam ki, dövlət nə dövlət, pul saman kimidir.* Ü.Hacıbəyov. **Dərisinə saman təpmək** – bax **dəri**. [Cəbi:] *Rəhmətliyin oğlu, sən zarafata salmısan nədir? Vallah, hacı adamın dərisinə saman təpər.* N.Vəzirov.

**SÁMAN** *is.* [*fars.*] Var, dövlət, sərvət, mal-mülk. *Fəqət zəhmət onun, saman sənindir! Söyüş, şallaq onun, vicdan sənindir*. Ə.Nəzmi.

**SAMANI** *sif.* Saman rəngində, sarıyaçalar, sarı. *Samanı parça*.

**SAMANLAMA** "Samanlamaq"dan *f.is.*

**SAMANLAMAQ** *f.* 1. Saman qatmaq, saman vurmaq, saman tökmək. *Palçığı samanlamaq*.

2. Heyvana saman vermək. *Atı samanlamaq*.

**SAMANLI** *sif.* 1. Saman qarışdırılmış, saman qatılmış. *Samanlı kərpic. Samanlı palçıq*.

2. Samana batmış, samana bulaşmış. *Yoğun aşpaz əlində kəfgir, qolları çirməkli, mehtər əlində xəlbir, üzü samanlı gəlirlər*. Ü.Hacıbəyov.

**SAMANLIQ** *is.* 1. Saman yığılan yer, saman saxlamaq üçün anbar, yer. *Axund məhərrəmin 8-ci günü uzun bir samanlıqda təziyə büsatını qurmuş və bir sınıq sandığı minbər əvəzinə altına qoymuşdu*. Qantəmir. *Samanlığın qabağında iki yəhərli at dururdu.* M.Hüseyn.

2. *məc.* Səliqəsiz, qaydasız, nizamsız, natəmiz yer haqqında. *Uşaqlara sən deyən kimi* [yol] *versəm, iki gündə bu evlər samanlığa dönər.* Mir Cəlal. [Ümid:] *Bizim idarəmiz gördüklərimizin yanında samanlığa oxşayır*. B.Bayramov.

**SÁMBO** *idm.* [*rus.* "самозащита без оружия" söz. ixtisarı] Güləş zamanı şiddətli ağrılara yol verən idman güləşmə üsulu. // Özündən daha güclü və ya silahlı rəqiblə mübarizə zamanı özünü qoruma vasitəsi.

**SAMBOÇU** *is.* Sambonu yaxşı bilən. *Gözəl samboçu.*

**SAMI** *is.* Boyunduruğun hər iki ucundakı qoşa deşiklərə salınan nazik ağac. [Salman əmi] *arabaçının samı qayırmaq üçün ağac axtardığını bilib sakit oldu.* Mir Cəlal.

**SAMİLƏR** b a x **semitlər**.

**SAMİT¹** *sif.* [*ər.*] Səssiz, sakit, dinməz, sakitcə. *Qanlıtəpə əhli sakit və samit dərin yuxuda idi*. S.M.Qənizadə. // Zərf mənasında. *Şəhrəbanu xanım ərinin sağ böyründə, çənəsini yaşmayıb ağ örpək başında, həllacı, samit əyləşibdir.* M.F.Axundzadə.

**SAMİT²** *is. dilç.* Səs axınının ağızda bu və ya başqa üzvün maneəsinə rast gəlməsi ilə tələffüz edilən səs.

**SAMMİT** *is.* [*ing.*] Dövlət başçılarının iştirakı ilə keçirilən zirvə toplantısı.

**SAMODİLƏR** *cəm* Bir sıra qohum şimal xalqlarının (nenlərin, selkupların və başqalarının) ümumi adı.

**SAMOVÁR** *is.* [*rus.*] İçi kömürlə doldurulan odluğu olan çay üçün su qaynadılan metal cihaz. *Ağ samovar. Armudu samovar.* – [Arvad:] *Hovuzun başında, kölgədə xalça salaram, samovarı sazlayıb qoyaram hovuzun başına, yaxşı çay dəmlərəm.* E.Sultanov. [Gülbacı:] *Axşamdır, samovarı qaynat!* T.Ş.Simurq.

**SAMOYEDLƏR** *cəm* Samodi xalqlarının köhnə adı.

**SAMUR** *is. zool.* Dələlər sinfindən boz rəngli qiymətli xəzi olan yırtıcı heyvan. *Sibir samuru. Samur dərisi. – Vəhşi heyvanlardan Lənkəran sahəsində bəbir və respublikanın bütün meşələrində çoxlu ayı, canavar, tülkü və Sibir samuru vardır.* M.Qaşqay. // Samur xəzindən. *Samur kürk*.

**SAMURAY** [*yap.*] Feodal Yaponiyasında: imtiyazlı hərbi zadəgan silkinə mənsub adam, habelə, ümumiyyətlə, hərbi, cəsur döyüşçü. [Yunus:] *Bacı, gedin rahat olun, adamlarınız sağ-salamatdır. Yapon samuraylarını da əzəndən sonra görüşəcəksiniz.* Mir Cəlal. // Təcavüzkar yapon militaristlərinə verilən ad.

**SAN** *is.* [*fars.*] 1. Şöhrət, nüfuz, hörmət, şan-şərəf (adətən ad-san şəklində işlənir).

2. B a x **say** 1 və 2-ci mənalarda. *Könül həsrət, can müntəzir, göz yolda; Ömür azaldı, vədə keçdi san ilə*. M.V.Vidadi. *Ələsgər, üsyanın çıxıbdı sandan; Öldürsən zənburu, əl çəkməz şandan*. Aşıq Ələsgər. *Kim deyir ulduzun göydə sanı var?* M.Rahim.

3. *köhn.* Təlim, yürüş. *Artıq İsfahan kəndində qoşuna san verildiyi zaman ordunun üç min nəfər atlıdan ibarət olduğu məlum oldu.* M.S.Ordubadi.

4. Sanki. [Külək] *Vurur, yıxır, dağıdır, sındırır, ucaldır səs; Bəşər vücudun san göstərir ədavətini*. C.Cabbarlı.

**SANAMA** "Sanamaq"dan *f.is.*

**SANAMAQ** *dan.* b a x **saymaq** 1 və 2-ci mənalarda. *Muzdur .. sonra pulları sanayıb*

*gördü ki, altmış doqquz min manat puldur.* S.M.Qənizadə. [Hacı Murad] *sandığın içindən mücrünü çıxardıb pulları sanayır.* S.S.Axundov. [Mirzə Cəmil:] *Allaha şükür, qız o qədərdir ki, hürkütməklə sanamaq olmur.* Ə.Vəliyev.

**SANARLAR** *is.* Böyük Qafqaz dağlarının cənub ətəklərində yaşamış tayfa.

**SANASAN** *bağl.* Guya, sanki, elə bil. *Yadıma hər bir düşəndə ol siyah kirpiklərin; Sanasan ki, sancılar bağrıma peykan, alaram.* M.P.Vaqif. *Məşşatə gözünə sürmə çəkəndə; Sanasan gözümə bıçağı çəkər.* Q.Zakir.

**SANATÓRİYA** *is.* [*lat.* sanare – müalicə etmək] Xəstələr üçün xüsusi rejimi olan və müxtəlif müalicə üsulları (hava, mədən suları, palçıq və s.) tətbiq edilən istirahət və müalicə müəssisəsi. *Sanatoriyada dincəlmək. Mədə-bağırsaq xəstəlikləri sanatoriyası.*

**SANBAL** *is.* Çəki, ağırlıq, vəzn.

**SANBALLAMA** "Sanballamaq"dan *f.is.*

**SANBALLAMAQ** *f.* 1. Bir şeyi əlinə götürərək ağırlığını, vəznini təxmini şəkildə yoxlamaq. *Kisəni sanballamaq. Qutunu sanballamaq. – Kərbəlayı Hatəmxan vəl üçün gətirilmiş daşdan bir yekəsini əlində sanballayıb, nifrin edən bala dərvişin döşünə çırpdı.* S.Rəhimov. [Paşa bəy] *yastı bir daş götürüb sanballadı.* Ə.Vəliyev.

2. Sahmanlamaq, hazırlamaq. [Veys] *iri zabit tapançalarını götürüb sanballadı..* Ə.Əbülhəsən.

**SANBALLI** *sif.* 1. Ağır, bərk, möhkəm, qurs. *Daş balaca idi, amma çox ağır, çox da sanballı idi.* "Koroğlu". *Dəmir qapıların sanballı qıfılları zırınqıltı ilə açıldı.* Çəmənzəminli. [Xəlil:] *Bu il məhsulumuz boldu. Maşallah, qozalar aman sanballıdı.* M.Hüseyn.

2. *məc.* Güclü, təsirli, dərin, ciddi. *Sanballı ifadə. Sanballı cümlə işlətmək. – Gecəm belə keçdi, səhərim gəlsin! Dadıma sanballı sözlərim gəlsin!* M.Müşfiq. [Qara Kərəmoğlunun] *söz ağzından külçə kimi ağır və sanballı* (z.) *çıxırdı.* M.İbrahimov. *Vəzn xoşuma gəlmir, yenisini seçirəm; Daha da dolğun olsun; daha sanballı, möhkəm.* R.Rza.

3. *məc.* Təmkinli, ciddi, ağır, ağırbaşlı. [Sübhanverdizadə] *özünü camaat arasında çox sanballı* (z.) *aparardı.* S.Rəhimov. [Mürsəl:] [Ataş] *həm də sanballı oğlandır, hər sözə cavab verməz.* Ə.Vəliyev. // Yaşlı, abırlı, hörmətli. *Sanballı adam.* // Adlı-sanlı, hörmətli, mötəbər. Sanballı alim.

4. *məc.* Əsaslı, böyük, dərin, ciddi. *Sanballı musiqi əsəri. Sanballı kitab.*

**SANCAĞAOXŞAR** b a x **sancaqvari**.

**SANCAQ** *is.* 1. Kağız vərəqlərini və s.-ni bir-birinə bəndləmək üçün dəmirdən qayrılmış ucu iti dəftərxana gərəyi. *Sənədlərə sancaq vurmaq.*

2. Yaxaya, başa sancmaq üçün adi və ya qiymətli metaldan qayrılan müxtəlif ölçülü və formalı qadın bəzəyi. *Yaqut qaşlı sancaq. Qızıl sancaq taxmaq. – Xonçada olar sabun, duxu, odekolon, sancaq, iynə, üskük, saçayıran, yelpazə.* R.Əfəndiyev. *Ərknaz heç kəsin ağlına gəlməyən sırğalar, kulonlar, qolbaqlar, bilərziklər, boyunbağılar, sancaqlar sifariş elərdi..* M.Hüseyn.

**SANCAQLAMA** "Sancaqlamaq"dan *f.is.*

**SANCAQLAMAQ** *f.* Sancaqla bənd etmək, sancaqla bərkitmək. *Kağızları sancaqlamaq. Yaxasını sancaqlamaq.* – [Firəngiz] *saçlarını bütöv geriyə daradı, yumrulayıb sancaqladı.* B.Bayramov.

**SANCAQVARİ** *sif.* Sancaq formasında, sancaq kimi, sancağaoxşar.

**SANCI** *is.* Bədənin hər hansı bir yerində, əsasən qarın boşluğunda, böyürdə baş verən kəskin ağrı. *Sancısı keçmək. Sancısı güclənmək. – Sancıdan özümü toxdadıb, bir az da getdim.* Çəmənzəminli. *Teybə böyrünün sancısından udqunub susdu.* M.Hüseyn. ☐ **Sancı tutmaq** – qarın boşluğunda, yaxud böyrəyində birdən kəskin ağrı başlamaq.

**SANCILANMA** "Sancılanmaq"dan *f.is.*

**SANCILANMAQ** *f.* Qarnından sancı tutmaq, bərk ağrı tutmaq. *Soyuqdəymədən sancılanmaq. – Gər dəysə soyuq, sancılanıb olsa da bimar; Hökm et, gələ cindar.* M.Ə.Sabir.

**SANCILI** *sif.* 1. Sancı tutmuş, sancılanmış.

2. Sancılmış halda olan, batırılmış vəziyyətdə olan.

3. Keçirilmiş, taxılmış, bənd edilmiş. *Qutunun içində altı cərgə səliqə ilə kəpənək, çəyirtkə və qeyri böcəklər kağıza sancılı halda düzülmüşdü.* Ə.Vəliyev.

**SANCILMA** "Sancılmaq"dan *f.is.*

**SANCILMAQ** *məch.* 1. Batırılmaq, qaxılmaq. *Külünglər torpağa sancıldı.* Ə.Vəliyev.

2. Taxılmaq, asılmaq, bənd edilmək, keçirilmək.

3. Batmaq, keçmək, girmək. [Canbalayev:] *..Necə olursa stəkan qırığının bir parçası dabanına sancılır.* İ.Hüseynov.

4. Qürub etmək, batmaq. *Axşam gün sancılanda Qədim dayı özünü şəhərə çatdırdı.* S.Rəhimov.

5. Dikilmək. *Hamının nəzəri Şərifzadənin dodaqlarına sancıldı.* M.Hüseyn. *..Sultanın gözləri qəribə parıltılı bir nəzərlə qardaşı oğlunun üzünə sancıldı.* İ.Hüseynov.

**SANCILMIŞ** *f.sif.* 1. Batırılmış, qaxılmış. *Yüz, yüz iyirmi addım uzaqda əl ilə sancılmış kimi, ağaca oxşayan yoluq bir şey seçilirdi.* Mir Cəlal.

2. Taxılmış, keçirilmiş. *Qadir .. birdən bağçanın qırağındakı fənər sancılmış ağacın dibində Sonanı gördü.* Ə.Əbülhəsən. [Musanın] *ensiz toqqasına həmişə ya qəzet, ya da kitab sancılmış olardı.* B.Bayramov.

**SANCMA** "Sancmaq"dan *f.is.*

**SANCMAQ** *f.* 1. Batırmaq, geydirmək, soxmaq. *Dərziyə dedilər köç, iynəni* (*papağına*) *sancdı.* (Ata. sözü). *Yetişmiş qızlar iynəni* [Kiçikbəyimin] *duvağına batırır, sonra yaxalarına sancırdılar.* Çəmənzəminli. // Məc. mənada. *Dağlar titrədi, ..göy qübbəsini doğrayan ildırımlar şığıyıb qızıl oxlarını qılınc qayaların təpələrinə sancdı.* Ə.Məmmədxanlı.

2. Taxmaq, ilişdirmək, keçirmək. *Dəli dəlini görəndə çomağını belinə sancar.* (Ata. sözü). [Koroğlu] *durnanın telindən dəstə kəsib Eyvazın papağına sancdı.* "Koroğlu". // Bənd etmək, ilişdirmək, keçirmək. *Səhər tezdən kişi sarayın yanına gəlir. Görür ki, molla çuxasının ətəyini sancıb belinə, əlində qazma sarayın divarının dibini qazır.* "M.N.lətif." *Leyli .. ətəklərini nazik belinə sancıb rəqs edir.* Ə.Məmmədxanlı.

3. Dişləmək. *Arı sancmaq. Əqrəb sancmaq. – Balaca uşaqlar gecələr yatmayıb şıltaq eləyəndə, anaları istəməyiblər şirin yuxudan ayılıb uşağa süd versinlər, ya görsünlər niyə uşaq ağlayır və bəlkə uşağı birə sancır, ya bəlkə bir özgə dərdi var.* C.Məmmədquluzadə.

4. Sanki bir şey batır kimi ağrımaq. *Ürəyi sancmaq. Başı sancmaq.* – [Sadıq kişi] *soyuqda oturduqca, özünə gəldikcə vücudu ağırlaşır, kürəkləri sancır.* Mir Cəlal. *..Mustafanın dirsəkləri elə bərk sancdı ki, gözləri yaşardı.* S.Vəliyev.

5. *məc.* Ağır söz deyib qəlbinə dəymək, incitmək, acılamaq, zəhərləmək. [Dilbər:] *Gülüş, sancmağı burax. Söylə məndən nə istəyirsən?* C.Cabbarlı. *Səməndər Nərgizi sancmağa fürsət tapdı.* B.Bayramov.

**SANDÁLYA** [*rus.*] b a x **səndəl**[2]. *Muxtar, sandalyasını xanımın masasına yaxınlaşdırdı və bir dəqiqədə yeməklərini də daşıyıb orada yerləşdi.* Çəmənzəminli. *O, yanındakı sandalyanın boş olduğunu ona andıran bir tövr ilə yerindən qımıldandı.* H.Nəzərli. // Skamya. *..Kəndli bir söz deməyib, vaqon biletçisinin göstərdiyi skamyada* (*sandalyada*) *uzanmış bir müsafirin ayağı tərəfində yer tutdu.* T.Ş.Simurq. *Sandalyanın cırıltısına qadınlar da gülüşdülər.* Mir Cəlal.

**SANDIQ** *is.* [*ər.* sənduq] 1. İçərisinə paltar və başqa şeylər qoymaq üçün taxtadan qayrılıb, üzəri dəmirlə işlənmiş, açarla açılıb-bağlanan qapaqlı iri uzunsov qutu (keçmişdə üstünə yorğan-döşək yığılardı). *Otağın divarlarındakı camaxatanda böyük sandıqların üstə ipək, zərzər üzlü əlvan yorğan-döşəklər və qu tüklü balışlar düzülərdi.* H.Sarabski. *Ağır sandıq seçmə parçalarla dolu idi.* Mir Cəlal.

2. *xüs.* Silahlarda patron, müxtəlif cihazlarda bir cür şeylər qoyulan qutu, borucuq və s. *Fotoaparatın sandığı. Pulemyotun sandığı.*

◊ **Sandıq ədəbiyyatı** *zar.* – nəşr edilməsi mümkün olmayan, heç kəsə lazım olmayan, zəif əsərlər haqqında. [Qız:] *Müəllimimiz deyir ki, bundan sonra atanın o sandıq ədəbiyyatını oxumağı sənə qadağan eləyirəm.* S.Rüstəm.

**SANDIQÇA** *is.* Kiçik sandıq. *Üzükləri sandıqçaya qoymaq.* – [Şəhrəbanu xanım:] *Şərəfnisə xanım, balam, pul sandıqçasını bura gətir.* M.F.Axundzadə. *Kərbəlayı Xəlil pul sandıqçasından bir karandaş çıxarıb, teleqrafçı verdiyi kağızı türkcə imzaladı.* T.Ş.Simurq.

**SANDIQDAR** *is.* [*ər.* sənduq və *fars.* ...dar] *köhn.* Sarayda, yaxud zadəgan evlərində maliyyə (pul) işlərinə baxan şəxs. *Bundan sonra Sərdar Rəşid sandıqdarı çağırdı, dörd yüz tümən gətirməsini əmr etdi*. M.S.Ordubadi.

**SANDIQXANA** *is.* [*ər.* sənduq və *fars.* ...xanə] *köhn.* Pul və qiymətli şeylər saxlanan yer. [Xırda xanım:] *Taxtın altında bir cüt çəkmə var, onu və sandıqxanada bir yapıncı var, onu da sənə verdim.* N.Vəzirov.

**SÁNİ** *sif.* [*ər.*] İkinci.

**SANİTÁR** *is.* [*lat.* zanitas – sağlamlıq] Müalicə müəssisələrində xəstələrə və yaralılara xidmət edən, həmçinin binanın təmizliyinə baxan kiçik tibb xidmətçisi. *Dülgərlər otaqlardan çıxar-çıxmaz sanitar-texniki briqada işə başlayır.* Mir Cəlal. // Yaralıya ilk yardım göstərib, onu döyüş sahəsindən çıxaran sıravi tibb xidmətçisi. *Sanitar dəstəsi. Sanitar briqadası. – Zəhra ağır yaralını sanitar batalyonuna çatdırdı.* Ə.Vəliyev.

2. *sif.* Sanitariyaya aid olan. *Sanitar maarifi. Şəhərin sanitar vəziyyəti.*

**SANİTARÍYA** [*lat.* sanitars – sağlamlıq və ars – sənət] Əhalinin sağlamlığını mühafizə etməyə və təmizliyi gözləməyə yönəldilmiş, gigiyenanın elmi tələblərinə əsaslanan tədbirlər sistemi. *Sanitariya qaydalarına əməl etmək.*

**SANİTARKA** *is.* [*rus.*] Xəstə baxıcısı (qadın). *Sanitarka Günəş də bu il İstisuda çalışırdı*. Ə.Vəliyev. *Bir gün* [Azad] *pilotkasını yan qoymuş gözəl bir sanitarkanın yaralı gətirdiyini gördü*. S.Rəhman.

**SANİYƏ** *is.* [*ər.*] Dəqiqənin altmışda bir hissəsi (vaxt ölçü vahidi). [Nurəddin] *suya batdı və bir neçə saniyədən sonra suyun üzünə çıxıb, üzməyə başladı.* S.S.Axundov. ..[Ümid] *Tahirənin burada olduğunu unutmuş kimi, bir neçə saniyə şəklin önündə dayandı.* B.Bayramov. ☐ **Bir saniyə** – bir azca, bir qədər, az. *Bir saniyə keçdi. – İki dünyadan o bir saniyə artıqdır – əgər; Aşiqin qəmli görüb naz ilə canan oxusun*. Ə.Vahid. **Bir saniyədə** – ani, çox tez, göz açıb yumunca bir ləhzədə. *Bir saniyədə yox oldu.*

**SANİYƏLİK** *is.* Saniyə müddətində olan (adətən saylarla). *Ortalığı bir neçə saniyəlik sükut bürüdü.* H.Nəzərli. *Enir bəbəkləri al qan içində; O bir saniyəlik toran içində; Xəyalən yanaşır Azərbaycana*. M.Rahim.

**SANİYƏN** *bağl.* [*ər.*] *klas.* İkinci, ikincisi, ikinci olaraq. *Əvvəla, o köhnə torlara ki biz düşmüşdük, parə-parə etməlisiniz, saniyən, tazə ixtiyarat tələb edib almalısınız.* N.Vəzirov.

**SANİYƏÖLÇƏN** *is.* Saniyənin onda birinə qədər dəqiqliklə ölçən cihaz. *Fasiləni saniyəölçənlə təyin etmək.*

**SANKİ** *bağl.* Elə bil (ki), guya. *Bu ay bizim ölkə sanki bir behişt olur, dağ-daş, dərə-təpə, səhra, çəmən – hamısı yaşıla bürünür, rəng-bərəng çiçəklər ilə bəzənir.* E.Sultanov. *Rüstəm kişi rayon mərkəzinə gəlib çatanda, sanki sinəsində iyirmi yaşlı bir cavanın ürəyi döyünürdü.* M.İbrahimov. *Ana ürəyindən sanki bir tel qırıldı*. M.Rzaquluzadə.

**SÁNKSİYA** [*lat.* sanctio – pozulmaz qanun] 1. *hüq.* Qanunun pozulmasına qarşı təsir və ya cəza tədbiri.

2. *kit*. İcazə, bəyənmə. [Məhəd:] *Günahı olmaya-olmaya qardaşım Mədədi tutub salıblar dama. Deyirlər, prokurorun sanksiyasıynan tutulub.* M.Hüseyn.

**SANQVÍNİK** *is.* [*lat.*] Qədim yunan həkimi Hippokratın aşkar etdiyi dörd temperament növündən biri.

**SAN(I)LI** *sif.* Sayılmış, sayla olan. *Sanlı pul durumsuz olar.* (Ata. sözü).

**SANLI** *sif.* Sanı (1-ci mənada) olan; hörmətli.

**SANMA** "Sanmaq"dan *f.is.*

**SANMAQ** *f.* Hesab eləmək, zənn etmək, güman etmək. *Sənsən sözüm, fikrim, zikrim, xəyalım; Sanma ki, bir özgə hekayətim var.* Q.Zakir. *Mövti-cismani ilə sanma mənim ölməyimi; Seyyida, ölmərəm aləmdə səsim var mənim.* S.Ə.Şirvani. [Vaqif Vidadiyə:] *Ömrün nəşəsindən sevinən kimi, əzabını da toy-bayram sanmalısan!* Çəmənzəminli.

**SANSKRÍT** *is.* Hind-Avropa dillərinə mənsub olan qədim hind ədəbi dillərindən biri.

**SANSOR** b a x **senzor**. ..*Əl yazısını kitab surətində birdəfəlik çap eləməgə sansor idarəsi mane olur*. C.Məmmədquluzadə.

**SANTİQRÁM** [*fr.* senti – yüz və gramme] Qramın yüzdə birinə bərabər ağırlıq vahidi.

**SANTİM** *is.* [*fr.*] Belçika, İsveçrə, Lüksemburq və Fransa frankının $^1/_{100}$-nə bərabər xırda pul.

**SANTİMÉTR** [*fr.* centi – yüz və metre] 1. Metrin yüzdə bir hissəsinə bərabər uzunluq vahidi.

2. Üzərində bu ölçüdə bölgülər çəkilmiş xətkeş, ya lent. *Kətmənin ağırlığı kiloqramyarım, ağzının eni 25-26 santimetr, hündürlüyü 23-28 santimetr olmalıdır.* Ə.Vəliyev.

**SANTİMETRLİK** *is.* Bir santimetr ölçüsü olma, santimetr uzunluğunda olma. *Santimetrlik radio dalğaları.* // Adətən saylara qoşularaq uzunluğun, qalınlığın və s.-nin neçə santimetr olduğunu göstərir. *Üç santimetrlik mıx.*

**SANTONÍN** [*lat.*] Hindyovşanından hazırlanan qurd dərmanı.

**SANTÚR** *is.* [*yun.*] *mus.* Qanunaoxşar, toxmaqcıqlarla çalınan mis telli çalğı aləti. *Al bu santurumu, çal, gəldi bahar əyyamı; Nəğmə əyyamı, mey əyyamı, xumar əyyamı.* A.Səhhət. *Çal, havalan, santurum; Çal ki, tellər oynasın! Donsun dərə, uçurum; Don ürəklər qaynasın!* A.Şaiq.

**SAP¹** *is.* Pambıq liflərindən, ipək tellərindən, yaxud süni liflərdən nazik eşilmiş ip. *Ağ sap. Qalın sap. İpək sap. – Səkinə də fikirli idi, .. bir dizinin dibində cürbəcür iynə, sap, düymə və çalkeçirt olan taxta qutu .. vardı.* M.İbrahimov. *Qərənfil bacı sap əyirirdi.* İ.Əfəndiyev. □ **Sap kimi** – son dərəcə nazik.

◊ **Sap kimi incəlmək** – çox arıqlamaq, həddindən artıq üzülmək. *Qasid gəldi haf kimi; İncəlmişdi sap kimi; Gözlə yarın qəlbini; Qırma çini qab kimi.* (Bayatı). **Sapa düzmək** – b a x **ipə-sapa düzmək** (“**ip**”də). *Köhnə həyat bağından; İnci kimi bir dastan; Sapa düzmək istəyir.* A.Şaiq. *Günlərimi sapa düzdüm; Dərdi qovdum, qəmə dözdüm.* B.Vahabzadə. **Sapa düzülmək** – b a x **ipə-sapa düzülmək** (“**ip**”də). *Məclisdəkiləri tamamilə heyran edən bu sözlər sanki sapa düzülmüşdü..* Ə.Vəliyev. **Sapı düyün salmaq** – b a x **kələfi dolaşdırmaq** (“**kələf**”də). **Ürəyinin sapı üzülmək** – b a x **ürək**. *Üzüldü durmaqdan ürəyin sapı; Axşama dönəndə açıldı qapı.* H.K.Sanılı. **Ürəyinin sapını qırmaq** – b a x **ürək**. *Gəl oxu eşqimin can kitabını; Qırma ürəyimin, qırma sapını.* S.Rüstəm.

**SAP²** b a x **dəstə²**. *Baltanın sapı. Külüngün sapı. – Lopatkanın sapı kişinin əlinə keçdi.* Mir Cəlal. *Belin sapını sıxdıqca* [Səməd] *ovuclarının qızışdığını hiss edir, əzələlərində tanış, ləzzətli bir sızıltı duyur.* İ.Hüseynov.

**SAP³** *is.* Bitkilərin budaq, yarpaq, çiçək kimi hissələrini daşıyan və ağaclarda odunlaşaraq gövdə halını alan hissəsi. *Armud ağzıma, sapı Savalana.* (Ata. sözü).

**SAPABƏNZƏR** b a x **sapvari**. *..Hələ lap uzaqda, bir ucu sahilə xeyli uzanmış, bir ucu dənizdə olan, küləkdə dalğalanan sapabənzər bir xətt gördüm.* M.Rzaquluzadə.

**SAPAN¹** *is.* Xış.

**SAPAN²** b a x **sapand**. [Əziz bəy:] *Belə düşmənlərdən yüzü olsun, yüz qarğaya bir sapan daşı.* M.F.Axundzadə. *Kim isə daşı sapana qoyur, Bəbir bəyin gicgahına vurur.* Mir Cəlal.

**SAPAND** *is.* Daş atmaq üçün qədim silah. [Xaspolad:] *..Sapandımı görmədin? Budur bax, sabah tezdən gedərəm, gözlərəm, bayıra çıxdı, bir böyük daş ataram, başın-gözün yararam.* C.Cabbarlı. [Səttarla Mahmud] *..kəndin bir tərəfində nişan qoyub sapand atardılar.* P.Makulu. // Xırda daş və s. qoyub atmaq üçün hər iki ucuna rezin bağlanmış haça ağac. *Sapandla quş vurmaq.*

**SAPBASAĞ** b a x **sapsağlam**. *Sapbasağ adam. Sapbasağ olmaq. – Məlhəm olurdu, sağalırdı yara; Əldə qalırdı yenə can sapbasağ.* M.Ə.Sabir.

**SAPDIRMA** “Sapdırmaq”dan *f.is.*

**SAPDIRMAQ** *f.* 1. Doğru yoldan çıxarmaq, pis yola salmaq, azdırmaq. [Tahir Muxtara:] *Bilirsiniz, pis yoldaş adamı yoldan sapdırarmış.* Çəmənzəminli. *Bu yanlış mühakimə onu yolundan azdırmış, qaranlıq, uçurumlu yollara sapdırmışdı.* A.Şaiq.

2. Əsas məqsəddən uzaqlaşdırmaq, fikrini çaşdırmaq, yayındırmaq. [Əbülhəsən bəy:] *..Qızı düşüncəsindən sapdırmaq üçün – sənin düşündüklərindən çox uzaqdayam, – deyə, vannaya keçdi.* M.S.Ordubadi. [Cavanşir:] *Mənim fikrimi sapdırma, qoca.* M.Hüseyn.

**SAPFİR** *is.* [*yun.*] Göy və ya sürməyi rəngdə olan qiymətli daş.

**SAPILCA** *is.* İçində ət və s. qızartmaq üçün uzundəstəli mis və s. metaldan qab. *Sapılcada yağ dağlamaq. – ..Bir boşqab, bir fincan və*

*bir sapılcadan ibarət mətbəx müxəlləfatımı bir tərəfə topladım*. Çəmənzəminli. *Tello qazanı düşürüb sapılcanı ocağın üstünə qoydu.* S.Rəhimov.

**SAPILMA** "Sapılmaq"dan *f.is.*

**SAPILMAQ** *f.* Başqa tərəfə dönmək, başqa yola girmək, yayınmaq. [Dəmirçioğlu dedi:] *Mərd igidlər müxənnətdən sapılsın; Qarı düşmən dərələrə təpilsin.* "Koroğlu".

**SAPITMA** "Sapıtmaq"dan *f.is.*

**SAPITMAQ** *f.* Ağlını, fikrini azdırmaq, çaşdırmaq, xərifləmək. [Xacə Nizam:] *Hər nə olmuşsa, mən etməm təhrif; Son zamanlarda sapıtmış o hərif.* H.Cavid.

**SAPQIN** *sif.* [*türk.*] Yolundan çıxmış, yolunu azmış, doğru yoldan uzaqlaşmış. *Sapqın adam*. – [Şeyx Hadi:] *Yola gəlsin də bəzi sapqınlar; Həq nədir, anlasınlar azğınlar*. H.Cavid.

**SAPQINLIQ** *is.* Doğru yoldan çıxma, azma. [Elxan:] *Zatən hər bir düha mühitin sapqınlığından, hər bir dahi mühitin yumruqları, təpikləri altından doğur.* C.Cabbarlı.

**SAPLAQ** *is.* Yarpağı, gülü, meyvəni budaqla birləşdirən nazik bərk hissəcik; bəndəm. *Gülün saplağı. Almanın saplağı.* – *Sultan əlini soyuq kola uzadaraq dırnaqları ilə bənövşənin nazik saplağını kəsir.* Ə.Sadıq.

◊ **Boğazı (boynu) armud saplağına dönmək, boğazı armud saplağı kimi nazikləşmək (nazilmək)** – son dərəcə arıqlamaq. *Rüstəm bəy gülümsündü: – Onun üçün ikisinin də boynu armud saplağına dönüb də.* Çəmənzəminli. *Balaca qızın boğazı armud saplağı kimi nazilmişdi*. M.Hüseyn. [Çimnaz arvad:] *..O qədər arıqlamısan ki, boğazın uzanıb armud saplağına dönübdür.* Ə.Əbülhəsən.

**SAPLAQCIQ** *is.* Kiçik saplaq, nazik saplaq. *Otun saplaqcığı. Gülün saplaqcığı.*

**SAPLAQLI** *sif.* Saplağı olan, bəndəmli. *Saplaqlı meyvə. Saplaqlı gül.* – *Çəmənlər arası yamyaşıl budaqların ara-bərəsindən uzun saplaqlı armudlar saralır, yupyumru almalar qızarıb allanırdı*. S.Rəhimov.

**SAPLAMA** "Saplamaq"dan *f.is.*

**SAPLAMAQ** *f.* 1. İynənin gözünə sap keçirmək. *İynəni saplamaq.* – *Həsən .. sap çıxardıb sapladı və barmağına üskük taxıb, şalvarın arxasını diqqətlə büzələməyə başladı.* Çəmənzəminli. [Maritsa] *iynəni çətinliklə saplayır, asta-asta tikirdi.* S.Vəliyev.

2. Əl yeri qayırmaq, sap taxmaq. *Baltanı saplamaq. Çəkici saplamaq*. – [Əsgər] *..xəlvət səngərə çəkilib çiynində kürk, əlində dəri əlcək bel saplayır, külüng itiləyir, kərki düzəldirdi.* Mir Cəlal.

3. Ucu şiş, iti aləti sapına (dəstəsinə) qədər soxmaq, keçirmək. [Yusif] *qoynunda saxladığı ufaq xəncəri xaqanın köksünə saplar*. H.Cavid. *Üzərini qapladım; Ürəyinə sapladım; O dilbilməz bıçağı.* S.Rüstəm.

**SAPLANMA** "Saplanmaq"dan *f.is.*

**SAPLANMAQ** *məch.* 1. Dəstəsinə qədər batmaq, girmək, keçmək, soxulmaq. *Onu hey andıqca hər axşam, səhər; Qəlbimin başına saplanır xəncər.* A.Şaiq. // *məc.* Batmaq, sancılmaq. [Səlim:] *Ah! Bu yalan bir söz, zəhərli bir ox; Ağzından uçub qəlbimə saplanır*. H.Cavid. *Fəqət bu qəhrəmanlıq, bu çevikliyə qarşı qüvvətli bir mizraq onun qəlbinə saplandı.* H.Nəzərli.

2. *məc.* Dikilib qalmaq (göz, baxış haqqında). *Nəhayət, gözləri Mənsurun gözlərinə saplandı, baxdı, baxdı, heç bir söz demədi.* C.Cabbarlı.

**SAPLI** *sif.* Sapı, dəstəsi olan. *Qara saplı bıçaq. Saplı bel.* – *Paşa bəy gümüş saplı qamçısını çəkməsinin burnuna vura-vura soruşurdu.* Ə.Vəliyev. *..Uzun saplı qəlyanını tüstülədə-tüstülədə qulaq asan Nəcəfalı kişi boğazını arıtlayıb içəri girdi.* B.Bayramov.

**SAPLICA** bax **sapılca**. *Qərənfil xala yağı əritmək üçün saplıcanı ocağın üstünə qoydu*. Ə.Vəliyev.

**SAPMA** "Sapmaq"dan *f.is.*

**SAPMAQ** *f.* 1. Düz yoldan çıxıb, sağa və ya sola dönərək başqa bir yola girmək, başqa istiqamət almaq; yolu azdırmaq. [Kor aşıq Qəhrəmana:] *Həmən qoşdum sağa-sola saparkən; Baxdım ki, səs gəlir bənövşəlikdən*. H.Cavid. *Atlı çaparaq; Yoldan saparaq; Günbatan tərəfə çapdı atını; Üfüqlər gizlədi o qaraltını*. S.Vurğun.

2. *məc.* Doğru yoldan çıxıb yanlış yola düşmək (çox vaxt "yol" sözü ilə bərabər işlənir). [Knyaz:] *Sən də onlar kimi sapmış* (f.sif.) *başıboş*. H.Cavid. *Qapılıb hissə bu gün doğru yolumdan sapdım!* S.Rüstəm.

**SAPPASAĞ** b a x **sapsağ**. [Sərvinaz qarı:] *Bir qoca sınıqçı taxta qoyub sarıdı, bir azdan sonra sappasağ oldu.* B.Bayramov.

**SAPSAĞ** *sif.* Lap sağ, tamamilə sağlam, sapsağlam. *Sapsağ uşaq. – Hüseynqulu ağa üzünü arvadına tərəf tutub dedi: – İndi sapsağ qızı azarlı edəcəksən.* S.S.Axundov. [Rəşid:] *Gövhər xanımı həyətdə sapsağ* (z.) *gördüyümü demək istəmirdim.* İ.Hüseynov.

**SAPSAĞLAM** *sif.* Heç bir xəstəliyi olmayan, tamamilə sağlam. *Sapsağlam oğlan.* – [Səlma] *Şükür, çox şükür, sapsağlam, könlü şad; Bu gün, yarın gəlmək üzrə Qanpolad.* H.Cavid. [Kərim baba] *yaşlı olduğu halda, daima açıq, geniş çöllərdə yaşamış bu adamın üzü ətli, yanaqları qıpqırmızı, vücudu sapsağlam idi.* A.Şaiq.

**SAPSAĞLAMLIQ** *is.* Tamamilə sağlam olma, heç bir xəstəliyi olmama; tamamilə sağlam adamın halı.

**SAPSAĞLIQ** b a x **sapsağlamlıq**.

**SAPSARI** *sif.* Lap sarı, tamamilə sarı, çox saralmış. *Kitabın sapsarı vərəqləri. – Sapsarıdır ağacların; Xəzəl olmuş yarpaqları.* S.Vurğun. *Gecə ay doğacaq, rəngi sapsarı; Göylərin sayrışan şux ulduzları; Buluddan buluda süzüləcəkdir; Sənsiz taqətləri uzüləcəkdir!* M.Müşfiq. *Bəhmən şaxta vurmuş adamlar təkin büzüşmüşdü. Bənizi sapsarı idi.* İ.Məlikzadə. □ **Sapsarı saralmaq** – xəstəlikdən, acından və s. səbəbdən rəngi saralmaq, solmaq. *Gəlin sapsarı saralsa da, özünü sındırmadı.* İ.Şıxlı.

**SAPSARILIQ** *is.* Sapsarı şeyin halı.

**SAPŞƏKİLLİ** *sif.* Sapa oxşayan, sap kimi; sapaoxşar. *Sapşəkilli tük. Sapşəkilli qurd.*

**SAPVARİ** *sif.* Sap kimi nazik, uzun; sapaoxşar.

**SAPYOR** *is.* [*fr.*] Mühəndis işləri ilə məşğul olan hərbi qulluqçu; minatəmizləyən.

**SAPYORLUQ** *is.* Sapyorluq peşəsi.

**SAR** *is.* [*fars.*] 1. Sərçələr sinfindən yırtıcı quş. *Tərlan yerin sar tutmaz.* (Ata. sözü). *İtkin düşdü tülək-tərlan; Sar da kəklik alan oldu.* Aşıq Ələsgər. *Tutun keçidləri, kəsin yolları; Tərlan ovlağında sar görünməsin.* H.Hüseynzadə.

2. *məc.* Yırtıcı, vəhşi mənasında. [İskəndər:] *Ey xaqan, mən hara, İskəndər hara? O igid qartalı bənzətmə sara.* A.Şaiq. *Bir tərlanı tora saldı qanlı sar; Bir göyərçin gəlib oldu xilaskar.* M.Rahim.

**SARAB** b a x **sərab**. *Lakin Ağabəyimin sığındığı sahil idimi, sarab idimi?* Çəmənzəminli.

**SARAFÁN** [*fars.* – "fəxri geyim" sözündəndir] 1. Uzun qadın paltarı, adətən qolsuz olur və köynəyin üstündən geyilir. (XIX-XX əsrlərdə Rusiyada ancaq kəndlərdə geyilərdi).

2. Adətən çiyinliklə tikilən qolsuz, yüngül yay qadın paltarı. *Çox çəkmədi, sarafan geymiş bir qadın içəri girdi.* Mir Cəlal.

**SARAĞAN** *is. bot.* Sarıyaçalar gövdəsi və xırda çiçəkləri olan, süpürgəşəkilli hündür kollardan ibarət bəzək bitkisi (bu bitkidən boyaq maddəsi kimi də istifadə edilir). *Şəmşir deyir, biilqarda bir etibar görmədim; Mən söyüddə, sarağanda, ulğunda bar görmədim.* Aşıq Şəmşir. *Əyinlərində sarağana, mazı xəmirinə, kəpək horrasına, əhəngə bulaşmış qısa tumanlı, bənizi soluq, arıq və xəstə görünüşlü fəhlələr nəzərə çarpır və onlar insana çox ağır təsir bağışlayırdı.* P.Makulu.

**SARALIB-SOLMA** "Saralıb-solmaq"dan *f.is.*

**SARALIB-SOLMAQ** b a x **saralmaq**. *Əlinlə qurduğun barlı bağçalar; Tufanlar qopsa da saralıb-solmaz.* S.Vurğun. *Düzənliklərdə alaqanqal enə-boya verir, tez baş qaldırıb, tez saralıb-solan* (f.sif.) *novruzgülləri hər yana sarı rəng çəkirdi.* Ə.Vəliyev.

**SARALMA** "Saralmaq"dan *f.is.*

**SARALMAQ** *f.* Sarı rəng almaq, sarı olmaq. *Stolların üstünə yığılmış qəzet, jurnallar rütubətdən saralmışdı.* İ.Əfəndiyev. *Yazısı pozulmuş kağız hisdən sapsarı saralmışdı.* B.Bayramov. // Yetişmək (meyvə haqqında). *Sonra o ilin payızında .. heyvalar saralanda, dam üstünə qalxmış tənəklərdə ağır üzüm salxımları aşağı asılanda Afaq da ilkini doğdu.* Ə.Məmmədxanlı. "*N*" *şəhərindən uzaqlaşarkən hər tərəfdə yetişmiş taxıl zəmiləri saralırdı.* S.Şamilov. // Xəzan olmaq, solmaq, soluxmaq. *Gün altında quruduqca vətən çölləri; Öz vaxtından tez saralır güllər, çiçəklər.* S.Vurğun. *Hava yavaş-yavaş tutulub qaralır, narın çiskin başlayır, asta yel saralan çinar*

*yarpaqlarını töküb ətrafa səpələyirdi.* S.Rəhimov. // Xəstəlikdən, dərddən, həyəcandan, qorxudan və s.-dən üzünün rəngi qaçmaq, solmaq. *Azardan saralmaq. Qorxudan saralmaq. – Eşq oduna yanan aşkara yanmaz; Pünhan-pünhan mənim kimi saralı.* Aşıq Ələsgər. *Şahməmməd adı eşidəndə pişxidmətin rəngi saraldı.* Çəmənzəminli. *Hər yerdən "doğrudur, doğrudur!" səsi gəldikcə Yarməmməd ölür, Salman saralırdı.* M.İbrahimov.

**SARALTI** *is.* Uzaqdan sarı rəngdə görünən şey. *Uzaqda saraltı görünür. – Qalmışdı buludda azca saraltı; Aşırdı dağları iki qaraltı.* H.K.Sanılı. *Səməd gözlərini kəndin üzərindən o tərəfə, saraltıları çəkilməkdə olan üfüqə dikdi.* İ.Hüseynov.

**SARALTMA** "Saraltmaq"dan *f.is.*

**SARALTMAQ** *f.* Saralmasına səbəb olmaq, soldurmaq. *Dərd-qəm qızı saraltdı. Azar uşağı saraltdı. – Gecə keçdi qaraldan; Seçilmirsən maraldan; Nə dərdim var, nə qəmim; Sənsən məni saraldan.* (Bayatı). [Şərəf xanım:] *Görürəm, qızı nə hala salmısan. Saraldıb heyvaya döndərmisən.* S.S.Axundov.

**SARAY** *is.* 1. Padşahın, dövlət başçısının, yaxud padşah ailəsinin daimi yaşadığı həşəmətli bina, ev. *Şirvanşahlar sarayı. Qış sarayı. – Oxu tar... Səsini dinləmiş; Şahların, xanların sarayı.* M.Müşfiq. // Ümumiyyətlə, öz həşəmət və əzəməti ilə nəzəri cəlb edən bina, ev. *Mərmər saraylar.*

2. İctimai təşkilatların olduğu bəzi böyük binaların adlarının tərkibində işlənir. *Səadət sarayı. Hökumət sarayı. – Klub və mədəniyyət saraylarında xalq çalğı alətləri ansamblları təşkil edildi.* Ə.Bədəlbəyli. [Fərman] *bu qızı bir həftə bundan əvvəl tikintinin mədəniyyət sarayında görmüşdü.* Ə.Sadıq.

◊ **Saray çevrilişi** – geniş ictimai qüvvələrin bilavasitə iştirakı olmadan bir padşahın saraydaxili qrup tərəfindən zorakı yolla başqası ilə əvəz edilməsi. *II Əbdülhəmid 1876-1909-cu illərdə Türkiyə sultanı olmuşdur. Liberal dairələrin başçısı Midhət Paşanın rəhbərliyi altında həyata keçirilən saray çevrilişi nəticəsində taxta əyləşmişdi.* "Hophopnamə".

**SARBAN** *is.* [*fars.*] Karvanı aparan, karvana başçılıq edən adam; dəvəçi. *Acıdın çobana, yoruldun sarbana.* (Ata. sözü). *Hər dəvənin örkəni şişpapaq, beli qəməli bir sarbanın əlində idi.* Çəmənzəminli. *Nəhayət, mahnı susarkən, qaranlıqdan sarbanın səsi eşidildi.* Ə.Məmmədxanlı.

**SARDÉLKA** [*ital.*] Qısa, yoğun sosiska.

**SARDÍNA** [*ital.* Sardina adasının adından] *zool.* Siyənək fəsiləsindən xırda balıq.

**SARƏNC** *is.* [*fars.*] Klassik Azərbaycan muğamlarından birinin adı. *Bu əsas ladlardan başqa, xeyli yayılmış əlavə ladlar və lad şöbələri də vardır ki, bunlara misal olaraq aşağıdakıları göstərmək mümkündür: "Şahnaz", "Sarənc", "Bayatı-kürd", "Hicaz", "Qatar" və s.* Ü.Hacıbəyov.

**SARĞI** *is.* 1. Yaranı sarımaq, sınığı bağlamaq və s. üçün uzun kəsilmiş tənzif, bez və s. parçası; bint. *Yaranı sarğı ilə bağlamaq. – Artıq sarğı hazır olduqda Vera Əjdərin köynəyini çıxarıb yarasını sarımaq istədi..* S.Rəhman. // Ümumiyyətlə, bir şey sarımaq üçün uzun kəsilmiş bez və s. parça. *Baş sarğısı* (*əmmamə*).

2. Müəyyən məqsədlə qola bağlanan ensiz parça. *Qollarında qırmızı sarğı olan nəzarətçilər gələnlərə yer göstərir, hamını nizam və qayda üzrə yerləşdirirlər.* M.Rzaquluzadə.

**SARI**[1] 1. *sif.* Narıncı rənglə yaşıl arasında olan (rəng), limon rəngi, qızıl rəngi. *Kiçik süfrənin qırağında qoyulmuş sarı samovar buğlana-buğlana zümzümə edirdi.* S.Qədirzadə. // *sif.* Bu rəngdə olan. *Sarı çit. Sarı parça. Sarı saç. Sarı kəhrəba. – Döyülən sarı köynəkli gənc bir qadın idi.* S.Hüseyn. // İs. mənasında. *Sarıları ağlardan ayırmaq.*

2. Müxtəlif mürəkkəb sözlərin və ya terminlərin birinci tərkib hissəsi; məs.: sarı zanbaq, sarı qızılgül, sarı acıotu, sarı bıtraq və s. – *Göy və sarı gilabı ilə baş yuyardılar.* H.Sarabski.

3. *is. dan.* Qızıl mənasında. *Təmiz vicdanı heç bir sarı ləkələyə bilməz!* S.Rəhimov. [Danışanlardan biri:] *Sarı yaman şeydir. Kökü kəsilsin yer üzündən sarı qızılın.* Mir Cəlal.

◊ **Sarı ev** *köhn.* – ruhi xəstələr üçün xəstəxana. ...**sarı yağ kimi yayılmaq (ürəyinə, canına, bədəninə** *sözləri ilə*) – çox xoşuna gəlmək, çox ləzzət vermək, çox məmnun olmaq. *Bu söz ürəyimə sarı yağ kimi yayıldı.*

*– İsti adamın bədəninə sarı yağ kimi yayılırdı.* Ə.Vəliyev. **Sarı simə vurmaq, sarı simdə çatdırmaq** – bir sözü, işi, mətləbi çox incə bir yolla çatdırmaq, nazikanə demək. *Əlikram Sənubərin memarlıqdan çox yer fizikası ilə məşğul olduğunu sarı simlərdə* [Hidayətə] *çatdırır*. B.Bayramov.

**SARI²** *qoş.* 1. Tərəf, səmt. *Qapıya sarı getmək. Evə sarı gəlmək. Üzünü pəncərəyə sarı çevirmək. – Bir uşaq .. təngnəfəs* [Aynaya] *sarı gəlirdi*. Ə.Məmmədxanlı. *Maşın cıdır düzünə sarı üz tutub sürətini daha da artırdı*. H.Seyidbəyli.

2. Ötrü, üçün (bəzən "ki" bağlayıcısı ilə). *Ondan sarı ki, heçnən adam boğazlayırlar*. Mir Cəlal.

3. **Sarıdan** şəklində – tərəfindən, cəhətindən. *Anam sarıdan nigaranam. – Bu gün neçə gündü canan sarıdan; Yetibdi guşuma səda, gedirəm.* Q.Zakir. [Dərviş:] *Bu binəvaların övlad sarıdan tək bir qızları var idi*. A.Divanbəyoğlu. [Reyhan Əzizə:] *Nə bilim, bala, ürəyim* [Azər] *sarıdan sakit deyil*. Ə.Məmmədxanlı.

**SARIBAŞ** *sif.* Başı (saçları) sarı, kürən. *Sarıbaş uşaq*. – [Tələbə:] *Bir az dayanmışdım, yanımdan 15 yaşında, sarıbaş bir qız gəlib keçdiyini gördüm.* Qantəmir.

**SARIBƏNİZ(Lİ)** *sif.* 1. Sarışın. *Sarıbəniz qız. – Uzunboylu, sarıbənizli, alagözlü taqım komandanı taqımı fişəng ilə təchiz edirdi*. H.Nəzərli. *Sarıbəniz uşaqlar həyəcanla bu məhbusları izləyirdilər*. S.Vəliyev.

2. Solğun sifətli, üzünün rəngi qaçmış, solğun. *Sarıbənizli xəstə. – Buna görə də Şiraslan gündən-günə arıqlayır, onun sarıbəniz sifəti getdikcə tutulur*(*du*). S.Rəhimov.

**SARIBƏNÖVŞƏ** *is. bot.* Açıq və ya tünd-sarı, yaxud mixəyi rəngli gülləri olan çoxillik bitki; şəbgülü. *Sarıbənövşə və ya şəbgülü .. açıq-sarı, tünd-sarı, mixəyi, tünd-mixəyi rəngli və kəskin xoş iyli çoxillik bitkidir, bağlarda və güllüklərdə becərilir*. M.Qasımov.

**SARI-BOZUMTUL** *sif.* Sarıya və boza çalan, boza yaxın (rəng). *Sarı-bozumtul parça.*

**SARIBUĞDA** *is. k.t.* İri, sarı dənəli buğda növü. *Sarıbuğda unu. Sarıbuğda əkini. – Yenə aşıb-daşacaqdır sarıbuğda anbarımız*. S.Vurğun. *Hər tərəfdə uzun zəhmət və əməyin məhsulu olan sarıbuğda samandan ayrılır və koma-koma yığılırdı.* M.İbrahimov.

**SARIBÜLBÜL** *is. zool.* Parlaq sarı tükləri olan oxuyan quş. *Sordum: – Nədən, sarıbülbül; Nəğməndən açılır könül?* N.Rəfibəyli. *Sarıbülbüllər, torağaylar, göycəqarğalar, cürbəylər, ənlikli bülbüllər hərəsi bir cür səslə oxuyub, səs-səsə verirlər.* E.Sultanov.

**SARICAOTU** *is. bot.* Sarı çiçəkləri bəzən sıx, bəzən də seyrək olan ot bitkisi.

**SARIÇİÇƏK** *is. bot.* Sarı çiçəkləri olan kol-bitki. [Səriyyə:] *Biz sarıçiçəklə örtülü yamaca çatanda günəş çıxdı*. İ.Əfəndiyev.

**SARIDİMDİK** *is. zool.* Dimdiyi sarı kiçik bir quş.

**SARIDÖŞ** *is.* Döş hissəsi sarı olan quş, at və s. // Sif. mənasında. *Sarıdöş alnının ortasında boz zolaq olan qaşqa kəhər burnundan buxar çıxa-çıxa onlara yaxınlaşanda, Maya yəhərin üstündə oturmuş Salmanı tanıdı.* M.İbrahimov.

**SARIGİLƏ** *is.* Girdə, şirin gilələri olan üzüm növü.

**SARIKOL** *is. bot.* Çubuqşəkilli uzun budaqları və sarı rəngli çiçəkləri olan kol bitkisi. *Nazağacı və ya sarıkol 3-4 metrə qədər hündürlükdə, qışda yarpağı tökülən koldur. Çubuq şəkilli budaqları yaşıldır və ona görə bitki həmişəyaşıl kimi görünür. Sarı rəngli çiçəkləri may-iyun aylarında açılır.* H.Qədirov.

**SARIKÖK** *is. bot.* Köklərində efir yağları olan tropik bitki. // Bu bitkinin ədviyyə kimi işlənən kökü. *Bığlarına bulaşan bozbaşın sarıkökünü yaylıqla sildikdən sonra Mirzə bu cürə başladı.* Qantəmir. *Gülgəz dərhal əmlik bir quzu kəsdirib ləzzətli yemək hazırladı. İçinə istiot, sarıkök, darçın vurdu.* İ.Əfəndiyev.

**SARIKÖKLÜ** *sif.* Sarıkök vurulmuş. *Sarıköklü piti.*

**SARIKÖYNƏK¹** *is. zool.* Sarı dimdikli, oxuyan quş; zərd. *Sarıköynəklər, qaranquşlar qayalar arasında oynaşır, kollar arasında itirlər.* Mir Cəlal.

**SARIKÖYNƏK²** *is. bot.* Qabığı sarı yemiş növü.

**SARI-KÜRƏN** *sif.* Qonur, açıq şabalıdı rəngli (at rəngi).

**SARIQ** *is.* 1. B a x **çalma³** 1-ci mənada. [Mərsiyəxan] *məğrur bir halda .. nəleynini geydi və iki əli ilə tirmə sarığını düzəltdi..*

Çəmənzəminli. *Mən sənə buyururam ki, bu saat gedib bu sarığı başından açasan, açmasan, vay sənin halına.* E.Sultanov.

2. B a x **sarğı** 1-ci mənada. *Qan quruyub sarığı daşa döndərmişdi.* Ə.Əbülhəsən. *Aslan cibindəki paketdən sarıq çıxarıb dedi..* S.Vəliyev.

3. Sarğı ilə bağlanmış şey, bağlı. *Müəllim birinci sarığı açdı.* Ə.Vəliyev.

**SARIQANAD(LI)** *sif.* Qanadlarının rəngi sarı olan. *Sarıqanadlı kəpənəklər.*

**SARI-QIRMIZI** *sif.* Tünd-sarı, qırmızıyaçalar (rəng). *Sarı-qırmızı kəlağayı.*

**SARI-QIZILI** *sif.* Tünd-sarı, qızılaçalar (rəng). *Sarı-qızılı parça. – Noyabrın sarı-qızılı örpəyi; Açıldıqca xəzəl olar yarpaqlar.* M.Dilbazi.

**SARIQLI** *sif.* 1. *din.* Başına sarıq qoymuş, başında sarıq olan, çalmalı. *Bu küçənin .. başı sarıqlı axundları ilə başı silindrli ziyalıları bir müqəddərat daşıyırdılar.* S.Hüseyn. *Sarıqlı mollanın "cahad" haqqındakı sözləri çox adamlara yer elədi.* Mir Cəlal. // *is.* Molla, ruhani, müsəlman din xadimi (bu mənada adətən "başısarıqlı" şəklində işlənir).

2. Bint, sarğı və s. ilə sarınmış, bağlanmış (yara, sınıq və s. haqqında). *Sarıqlı qol. Sarıqlı ayaq. Üzü sarıqlı olmaq. – Bir gün Hacı Rüstəmin dükan qonşusu usta Həsən papaqçı gördü: budur Hacı, başı, gözü sarıqlı yaman bir halda gəlir.* Ə.Haqverdiyev. *Xavər dörd aylıq dəhşətli əzablardan arıqlamış, ordları batmış Kərimxana baxır, gözünü sarıqlı gözündən çəkə bilmirdi.* M.İbrahimov.

3. İp, sarğı və s. ilə bağlanmış. *Dərviş gözünü açıb gördü ki, bir divin dalısında əl-ayağı sarıqlı gedir.* (Nağıl).

4. Üzərinə bir şey sarınmış. *Şəkildə görünən zatın başındakı sarıqlı fəs, əynindəki gen və biçimsiz şalvar, onun ayağındakı qıvraq çarıq qızın diqqətini özünə cəlb etmişdi.* M.S.Ordubadi.

**SARILI** *sif.* Sarılmış, sarğı ilə bağlanmış. *Müəllimin böyründə qəzetə sarılı iki şey vardı.* Ə.Vəliyev.

**SARILIQ** *is.* 1. Sarı şeyin halı, sarı rəngdə olma.

2. *tib.* Qaraciyərin fəaliyyətinin pozulması nəticəsində bəzən dərinin sarı rəng alması şəklində təzahür edən xəstəliyin adı. *Bu hadisədən Molla Qasım sarılıq azarına düşüb xəstə yatdı.* S.S.Axundov.

**SARILMA** "Sarılmaq"dan *f.is.*

**SARILMAQ** *f.* 1. Bir şeyin ətrafına, dövrəsinə dolanmaq, dövrələnmək. *Gülab ilə sığallanır, sulanır; Baş qoyur, sarılır qulağa zülfün.* M.P.Vaqif. [Xanımın] *çəhrayı arxalıq sinəsində yarımdairə təşkil edərək qızıl toqqa sarılmış* (f.sif.) *incə belində düymələnmişdi.* Çəmənzəminli.

2. Bükülmək. *Parça kağıza sarılıb. – Tüfəng yağlı bir əsgiyə sarılıb küncdə qoyulmuşdu.* M.Rzaquluzadə.

3. *məc.* Bir-birini qucaqlamaq, qucaqlaşmaq. *Kiçik daxmada üç nəfər fəlakətzədə xəyalat içində huşa gedib bir-birinə sarılmışdı.* C.Cabbarlı. *Ana-qız bir-birlərinə sarıldılar.* S.Rəhman.

4. *məc.* Bir şeydən bərk-bərk yapışmaq, böyük həvəslə, şövqlə bir şeyə girişmək. *Bu varlığınla saril zəhmət ilə biliyə; Başın dönsün günəşə, qolların bir çəliyə.* A.Şaiq. *Deyirlər sarılıb diləklərinə; Zəhmətə məftunsan bir aşıq* kimi. M.Müşfiq. □ **Qələmə sarılmaq** – yazmağa, yazıçılığa, mühərrirliyə başlamaq. *Nurcabbarın ürəyi dolu idi və ürəyini boşaltmaq üçün qələmə sarılmaqdan savayı əncam görmürdü...* İ.Məlikzadə.

◊ **Silaha (qılınca) sarılmaq** – silahla silahlanmaq, qılıncla silahlanmaq, əlinə silah (qılınc) götürmək, silahdan (qılıncdan) yapışmaq. *Bu gün silaha sarılaraq* [inqilab] *mübarizəsinə qalxan bütün təbrizlilər bilməli və yaddan çıxarmamalıdır ki, hazırda başladığımız bu qiyam rus xalqının əleyhinə deyil.* M.S.Ordubadi. [Elçin:] *Ağvan cəngavəri on səkkiz yaşından qılınca sarılır.* M.Hüseyn.

**SARIMA** 1. "Sarımaq"dan *f.is.*

2. Sarıma işi ilə məşğul olan, sarıyıcı.

**SARIMAQ** *f.* 1. Bir şeyin üzərinə dolamaq. *Yumaq sarımaq. – O əllər .. cəhrə dolandırmaqdan, lülə sarımaqdan qabar olub, ağaca dönmüşdü.* Ə.Əbülhəsən.

2. İp və s. ilə üstündən, hər tərəfdən dövrələmə bağlamaq. *Qutuları sarımaq. Kitabları sarımaq.* // İp və s. ilə başqa bir şeyi üzərinə bağlayaraq bənd etmək. [Koroğlunu] *sonra bir-iki kəndirlə də sarıdılar ata.*

"Koroğlu". [Qədiri] *dirəyə sarıdılar.* Mir Cəlal. // Sarğı dolamaq, sarğı ilə bağlamaq. *Ayağını sarımaq. Başını sarımaq. – Sınıqçı, Məşədi Əsgərdən üç manat alıb qolunu sarıdı.* S.M.Qənizadə. *Hənifə arvadla Gülgəz Səmədin dizinin tikanlarını çıxardıb yarasını sarımışlar..* İ.Hüseynov.

3. *məc.* Bürümək, tutmaq, qaplamaq, çulğamaq. [Nüşabə:] *Sənə qəlbimdə bir iman vardı; Könlümü şübhə, tərəddüd sarıdı.* A.Şaiq.

4. *məc.* Ələ salmaq, dolamaq, araya qoymaq. *Bir başqa tələbə Əsədi sarımaq istədi.* S.Rəhimov.

**SARIMSAQ** *is. bot.* Soğan cinsindən çox kəskin iyi və dadı olan tərəvəz.

**SARIMSAQLI** *sif.* Sarımsaq qatılmış, sarımsaq vurulmuş, içində sarımsaq olan. [Məsumə] *Firəngizin arzusu ilə bişirdiyi buğlamanı, sarımsaqlı qatığı süfrəyə gətirdi.* B.Bayramov. [Sultan:] [Səməd] *buralarda ol, gedək evə, sənin üçün sarımsaqlı, iştahaaçan şey bişirtdirim.* İ.Hüseynov.

**SARIMSAQOTU** *is. bot.* Meşəlik yerlərdə bitən ikiillik yabanı bitki. *Sarımsaqotu .. meşəlik yerlərdə bitən və 20-100 sm hündürlükdə olan ikiillik qollu-budaqlı bitkidir.* M.Qasımov.

**SARIMSOV, SARIMTIL** *sif.* Sarı rəngə çalan, sarıyaçalar. *Sarımtıl saç. Sarımtıl parça. Sarımtıl qaş. – Bu zaman su sarımtıl bir rəngə çalırdı.* S.Rəhman. [Leytenant] *papiros çıxartdı, kibritin sarımtıl alovu* [leytenantın] *üzündə titrədi.* İ.Əfəndiyev.

**SARIMTRAQ** b a x **sarımtıl**. *Sarımtraq üz. Sarımtraq lent.* – [Araz] *ayılarkən kameranın içərilərinə uzanan sarımtraq bir işıq zolağından səhər olduğunu bildi.* A.Şaiq.

**SARINMA** "Sarınmaq"dan *f.is. Pristav Mehdi bəyin ağaca sarınması xəbəri bütün mahala yayılır.* "Qaçaq Nəbi".

**SARINMAQ** *f.* 1. Bürünmək, örtünmək. *Çadraya sarınmaq. Örpəyə sarınmaq. – Mənim kimi bir sirdaşın yanında; Qayım-qayım sarınmağın nədəndir?* M.P.Vaqif. *Molla abasına bərk sarındıqdan sonra məktubu Qurbana oxudu.* A.Şaiq.

2. Sarğı ilə bağlanmaq. [Roza:] *Əllərimlə sarınarsa bir yara; Zəhərli də olsa, çapuq sağalar.* H.Nəzərli.

3. İp, qayış və s. ilə başqa bir şeyin üzərini bərk-bərk bağlayıb bənd edilmək. *Çarpayıya sarındığım üçün dikələ bilmədim.* Mir Cəlal.

**SARINTI** b a x **saraltı**. *Doktor qabaqca Rzaquluxanın üzünü mülahizə edirdi. Çöhrəsi qayət solğun isə də yanaqlarında sarıntı ilə qarışıq bir qırmızılıq qalmışdı.* M.S.Ordubadi.

**SARISAÇ(LI)** *sif.* Saçı sarı; kürən. *Sarısaçlı qız. Sarısaç uşaq. – ..İkinci maşının qabağında .. sarısaç bir oğlan durmuşdu.* Mir Cəlal. *..Qaradinməz oğlana nəzər salan sarısaç katib əlini pəncərəyə tərəf tuşladı..* B.Bayramov.

**SARISƏNDƏL** *zool.* b a x **sarıköynək**[1]. *..Bir sıra quşların erkək və dişiləri rənglərinə və digər xarici əlamətlərinə görə fərqlənirlər. Məsələn, damsərçəsi, qırqovul, sarısəndəl .. və sairə rənglərinə görə seçilirlər.* A.Ələkbərov.

**SARISİFƏT(Lİ)** *sif.* Üzünün rəngi saralmış. *Sarısifət adam.*

**SARISÜSƏN** *is. bot.* Bataqlıq yerlərdə bitən sarı gövdəli bitki.

**SARIŞIN** *sif.* Sarıyaçalar, sarıyağız. *Sarışın saç. Sarışın oğlan. Sarışın üz. – Şərifzadənin yanındakı gənc sarışın, enlikürəkli, xoşsima bir adam idi.* P.Makulu. *Səməd utancaqlıqla süfrənin böyründə durmuş, sarışın, çatmaqaş, cığalı qıza baxdı.* İ.Hüseynov.

**SARIŞMAQ** b a x **sarmaşmaq** 2-ci mənada. *Görüşübən eyləmədik xoş səfa; Qucaqlaşıb sarışmadıq, ayrıldıq.* M.P.Vaqif. *Gəlin, salamlayaq doğma baharı; Ana yurdumuzun ana qolları; Baharın boynuna sarışan gündür.* N.Xəzri.

**SARITİKAN** *is. bot.* Yarpağı tikanlı, sarı gövdəli bitki.

**SARIYAÇALAR** b a x **sarımtıl**. *Sarıyaçalar parça. Sarıyaçalar sap.*

**SARIYAĞIZ, SARIYANIZ** *sif.* Üzünün rəngi və saçları sarıya çalan; sarıbəniz, sarışın. *Feldşer yanındakı sarıyağız kök oğlana göz vurdu.* M.Hüseyn. *Sarıyağız, ucaboy, şıq geyimli bir kişi gözucu salam verib,* [Vahid ilə Rübabənin] *yanından ötdü.* Mir Cəlal.

**SARIYICI** *is.* Sap, ip və s. sarıyan fəhlə. *İpək sarıyıcısı. Zavodun qabaqcıl sarıyıcısı.*

**SARIZANBAQ** *is. bot.* Zanbağın sarı növü.

**SÁRJA** [*fr.* serge] Sapı diaqonal toxunmuş astarlıq parça.

**SARKÁZM** [*yun.* saqkasmos] *ədəb.* Çox acı, kəskin gülüş, kinayə. *Bu yazılarda .. imperialistlərə qarşı öldürücü bir sarkazm vardır.* M.İbrahimov.

**SARKOFÁQ** [*yun.* sarkophaqos] Qədim xalqlarda daş tabut; sonralar – məqbərə.

**SARKÓMA** [*yun.* sarkoma – ət törəməsi] *tib.* Adətən sümük toxumalarında əmələ gələn xətərli şiş. *Sümük sarkoması.*

**SARQAC** *is.* 1. Qapqara, makara.

2. Məftil sarınmış çarx.

**SARMA** 1. "Sarmaq"dan *f.is.*

2. Parça üzərində güləbətinlə işlənmiş incə naxış, bəzək. [Kənd qızları] *yeridikcə köynəklərinin ətəklərinə, küləcələrinin yaxalarına tikdikləri sarmalar, gümüş pullar səslənirdi.* Ə.Abasov.

**SARMAQ** *f.* Bürümək, tutmaq, çulğamaq, qaplamaq; yayılıb təsiri altına almaq. *Sağ ol! Saq ol! – səsləri məclisi sardı.* M.Müşfiq. *Biz döyüşdük günəşə bağlı qalan ümidlə; Döyüşdük, gur səsimiz geniş çölləri sardı.* R.Rza.

**SARMALAMAQ** b a x **sarmaq**. *Günəş məmnun gülümsəyərək qoltuğundakı şalla Arazı bir uşaq kimi sarır, sarmalayır.* A.Şaiq.

**SARMAŞIQ** *is. bot.* Ağ-qırmızımtıl çiçəkləri olan, sarmaşaraq uzanan bitki. *Qəməriyənin dörd tərəfini əlvan çiçəkli sarmaşıqlar almış*(*dı*). A.Şaiq. *Pəncərədən baş uzatsın otaqlara sarmaşıq; Üzə gülsün hər səliqə, hər şeydəki yaraşıq.* S.Vurğun.

**SARMAŞMA** "Sarmaşmaq"dan *f.is.*

**SARMAŞMAQ** *f.* 1. Bir şeyin ətrafına dolanmaq, sarılmaq. *Eləmi tikan gülə; Sarmaşıb tikan gülə; Fələk də göz dikibmiş; Mən gözüm dikən gülə.* (Bayatı). *Dəmirov Əlisanın yay otağını gözdən keçirib: – Doğrudan da gözəldir, – dedi, – sarmaşıqlar qəribə sarmaşıbdır.* S.Rəhimov.

2. Qucaqlaşmaq, bir-birinə sarılmaq. *Bəyrək və yoldaşları cəfakeş kürəkçilərlə həsrətli doğma qardaşlar kimi bir-birlərinə sarmaşdılar.* M.Rzaquluzadə. *Ana ilə bala bir-birinə sarmaşdılar.* Ə.Məmmədxanlı.

**SARMATLAR** Eramızdan əvvəl VI-II əsrlərdə Volqa çayı, Qara dəniz və Azov sahillərindəki çöllərdə yaşamış köçəri tayfalardan bir qrupunun adı.

**SARP** *sif.* Keçilməsi, üstünə çıxılması çox çətin olan; çox dik, sıldırım, yalçın. *Yolun sağ tərəfindəki sarp qayanın arxasından üfüq ağarmağa başladı.* H.Nəzərli. *Tiflis şəhərini iki yerə təqsim edən Kür çayı sarp qayalara çarparaq hiddətlə çağlayırdı.* A.Şaiq. *Bir azdan Aran çayının sarp qayalıqları iniltili bir səslə əks-səda verdi.* İ.Hüseynov.

**SARPİNKA** *is.* [*rus.*] Nazik pambıq parça.

**SARPMA** "Sarpmaq"dan *f.is.*

**SARPMAQ** b a x **sapmaq**. [Qəhrəman] *məsələni çox soyuqqanlılıqla həll etmək, Yusifi sarpdığı əyri yoldan doğru yola dəvət etmək istəyirdi.* Ə.Vəliyev.

**SARSAQ** *sif.* Səfeh, gic, axmaq, abdal. *Sarsaq köpək qaysavadan pay umar.* (Ata. sözü). // Mənasız, boş, ağılsız (söz, hərəkət, iş və s.). [Cahangir ağa:] *Ondan sarsaq iş baş verməz.* Ə.Haqverdiyev. // Zərf mənasında. *Sarsaq danışmaq.* – [Niyaz:] *A kişi, sarsaq olma, gəl odunu şələlə dalına, itil cəhənnəmə.* Ə.Haqverdiyev. // *İs. mənasında.* Bəzən söyüş kimi işlənir. [Hacı Bayram:] *Sarsağın qızı, məni kim öldürəcək?!* Ə.Haqverdiyev.

**sarsaq-sarsaq** *zərf* Gic-gic, axmaq-axmaq, mənasız. *Sarsaq-sarsaq danışmaq. Sarsaq-sarsaq gülmək. – Teymur hirslənir ki: – Nə sarsaq-sarsaq danışırsan? Necə yəni qaz birqıçlı olar?* "M.N.lətif."

**SARSAQCA(SINA)** *zərf* Axmaqcasına, ağılsızcasına. *Sarsaqcasına inad etmək. Sarsaqca hərəkət etmək.*

**SARSAQLAMA** "Sarsaqlamaq"dan *f.is.*

**SARSAQLAMAQ** *f.* Səfehləmək, ağlını itirmək, gicləşmək, axmaqlamaq; xərifləmək. *Müəllimi gülmək tutmuşdu. Fikrinə gəlirdi ki, bu adam sarsaqlamışdır.* S.Hüseyn. // Sarsaqlaşmaq, başı xarab olmaq. [Misir:] [Behbud] *sizin nəslin hamısı qocalanda sarsaqlayır.* Ə.Vəliyev. // Sarsaq iş tutmaq, sarsaq hərəkət etmək, sarsaq danışmaq. [Leyla:] *A kişi, başa düş, gəl sarsaqlama; Ağrımaz başına yaylıq bağlama.* S.Rüstəm.

**SARSAQLAŞMA** "Sarsaqlaşmaq"dan *f.is.*

**SARSAQLAŞMAQ** *f.* Getdikcə ağlını itirmək, gicləşmək, axmaqlaşmaq, xərifləmək.

**SARSAQLIQ** *is.* Axmaqlıq, ağılsızlıq, giclik, səfehlik. *Sarsaqlığından işlər başına gəlir.* – [Şamil:] *Mənim dəstəmdən xain? Yaxşı, olsun! Əgər o doğrudan da sarsaqlıq eləmişsə, əmin olsun, cəzasını mən özüm verəcəm.* M.Hüseyn. // Sarsaq hərəkət, axmaq iş.

**SARSIDICI** *sif.* 1. Çox güclü, çox ağır, dağıdıcı, məhvedici. *Sarsıdıcı zərbə endirmək.* – *Sarsıdıcı zərbə altında dayanmayan düşmən təyyarələri geri qaçırdı.* S.Rəhimov.

2. *məc.* Çox təsirli, çox həyəcanlı, çox güclü, adamı sarsıdan. *Sarsıdıcı mənzərə. Sarsıdıcı hadisə. – Mahrunun gətirdiyi xəbər sarsıdıcı bir xəbər idi.* M.S.Ordubadi. *Rəisin sözləri həkim üçün nə qədər gözlənilməzdisə, bir o qədər də sarsıdıcı idi.* Ə.Vəliyev.

**SARSILMA** "Sarsılmaq"dan *f.is.*

**SARSILMAQ** *f.* 1. Şiddətli zərbədən dağılmaq, uçmaq, böyük zədə almaq; titrəmək. *Bizim təyyarələr... Od saçır hər yan; Topların səsindən sarsılır cahan.* M.Rahim. *Yaxınlığa düşən mərmi partlayışından qazma möhkəmcə sarsıldı, lampa söndü .. ara qarışdı.* Ə.Əbülhəsən.

2. *məc.* Təsirli, kədərli bir xəbərdən, işdən, hadisədən və s.-dən çox böyük həyəcan keçirmək, ruhi əzab çəkmək, mütəəssir olmaq, sarsıntı keçirmək. *Oğlan bu dəhşətli tələbdən sarsıldı.* Mir Cəlal. *Kamal bu sərt, amansız həqiqəti ona söyləyəndə ana sarsılmışdı..* M.Rzaquluzadə.

3. *məc.* Qırılmaq, puç olmaq, alt-üst olmaq. *Onun ümidləri hər tərəfdən sarsılmışdı.* M.S.Ordubadi.

**SARSILMAZ** *sif.* Möhkəm, mətin, səbatlı, dayanıqlı, dəyişməz, dağılmaz, pozulmaz. *Qətibə .. Nizaminin qadın gözəlliyi qarşısında sarsılmaz olduğunu bir neçə kərə sınaq etmişdi.* M.S.Ordubadi. *Paxır götürməyən düzlük, açıqlıq; Sarsılmaz qalamdır, yuvamdır mənim!* X.Rza.

**SARSILMAZLIQ** *is.* Möhkəmlik, səbatlılıq, dayanıqlılıq, dağılmazlıq, pozulmazlıq, dəyişməzlik.

**SARSIMA** "Sarsımaq"dan *f.is.*

**SARSIMAQ** *f.* 1. Güclü bir zərbədən titrəmək, lərzəyə gəlmək, yerindən oynamaq.

2. *məc.* Güclü həyəcan keçirmək, sarsılmaq (bu mənada adətən tərkiblərdə işlənir). *Sübhanverdizadə əli ilə onun saçını tumarlaya-tumarlaya barmağını onun çənəsinə toxundurdu və ildırım vurmuş kimi bütün vücudu ilə sarsıdı.* S.Rəhimov.

**SARSINTI** *is.* 1. Bərk zərbə nəticəsində tərpənmə, lərzəyə gəlmə, yerindən oynama; titrəyiş, zəlzələ. *Yer sarsıntısı* (*zəlzələ*). – *..Möhkəm bünövrəsi olan bir binanı hansı sarsıntı uçura bilər?* S.Rəhimov.

2. *məc.* Həyəcan. *Deyirsən, dərd oldu bizə eşqimiz; Sarsıntı, üzüntü yetməzmi artıq?* B.Vahabzadə.

3. *məc.* Ağır ruhi əzab, həyəcan, müsibət. *Böyük sarsıntıya düçar olmaq. – Qaraş ruhi sarsıntı içərisində oturub fikrə getmişdi.* M.İbrahimov. *Muxtara getdikcə daha artıq sarsıntı üz verirdi.* B.Bayramov.

**SARSINTILI** *sif.* 1. Silkələnən, yırğalanan, laxlayan, sarsıntıdan zədələnmiş; davamsız, etibarsız. *Sarsıntılı divar. Sarsıntılı pilləkən. – Otaqdan qarasifət, dolaşıq saçlı, pəjmürdə bir qadın çıxıb, sarsıntılı balkonda durdu.* Çəmənzəminli.

2. *məc.* Qüssəli, kədərli, pəjmürdə, halı pozulmuş.

**SARSITMA** "Sarsıtmaq"dan *f.is.*

**SARSITMAQ** *f.* 1. Lərzəyə salmaq, titrətmək, yerindən oynatmaq, laxlatmaq, dağıtmaq, pozmaq, alt-üst etmək. *Zəlzələ bir çox binanı sarsıtdı. – Böyük bir gurultu ətrafı sarsıtdı.* M.İbrahimov.

2. *məc.* Dəhşətə gətirmək, lərzəyə salmaq. *Faşizmin gözünə sancdınız bir ox; Sarsıtdı zərbəniz lovğa düşməni.* R.Rza.

3. *məc.* Müvazinətini pozmaq; bərk həyəcanlandırmaq. *Başqa mühit, başqa vəziyyət meyli* [Rozanın] *dəruni aləmini sarsıtmışdı.* Çəmənzəminli. *Arvadının ölümü Haşım kişini bərk sarsıtmışdır.* Ə.Vəliyev.

**SARVAN** b a x **sarban**. *Sarvanlar uyqulu, dəvələr yorğun; Nədir bu heçlikdə bu gülünc oyun?!* M.Müşfiq. "*Allahü-əkbər!*" – *deyə sarvan dua oxuyur.* B.Vahabzadə.

**SASANİLƏR** *is.* Sasanilər dövlətində (İran) hakimiyyətdə olan sülalə.

**SATAŞQAN** *is.* və *sif. dan.* Adama sataşmağı, öcəşməyi, sürtüşməyi sevən, adam ələ salan. *Sataşqan adam. Yaman sataşqansan ha...*

**SATAŞMA** "Sataşmaq"dan *f.is.*

**SATAŞMAQ** *f.* 1. Birini acıqlandırmaq, pərt etmək, qanını qaraltmaq, təhqir etmək, ələ salmaq məqsədilə ona söz atmaq və ya başqa bir hərəkət göstərmək; sürtüşmək. [Murad bəy:] *Bax, bu adam hər kəssə, sənə sataşmaq istəmişdir, aş qazanını aparmışdır.* T.Ş.Simurq. [Gülzar:] *Onların ağzı nədi sənə sataşırlar, birçəklərini bircə-bircə yolaram.* İ.Hüseynov. // Zarafat məqsədilə söz atmaq, sürtüşmək, pərt etmək. *Dilbərin rəfiqəsi yenə də oğlana sataşmaq istədi: – Kişi Fərhaddır, Fərhad! Görmürsən?* Ə.Sadıq.

2. Namusuna toxunmaq. [Qarı:] *O Bəylər qarnı yanmış, qız dükana şey almağa gəldikdə çəkib namusuna sataşmışdı.* Çəmənzəminli. [Əliyar Toğrula:] [Yaşar] *suyumuzu kəsir, qənd vermir, çay vermir, üstəlik bir arvad-uşağımıza da sataşır.* C.Cabbarlı.

3. Toxunmaq. [Həsənin] *barmaqları zurnaya sataşcaq, əlinə alıb bir segah çaldı.* B.Talıblı.

◊ **Gözü sataşmaq** – b a x **göz**. [Gülçöhrə:] [Arşınmalçının] *gözü gözümə sataşanda elə bil ki, ildırım kimi məni vurur.* Ü.Hacıbəyov.

**SATDIRMA** "Satdırmaq"dan *f.is.*

**SATDIRMAQ** *icb.* 1. Satmağa məcbur etmək.

2. Başqasının vasitəsilə satmaq. *Köhnə paltarını satdırmaq*.

**SATHASAT** *is.* Çox qızğın, arasıkəsilməyən satış, alver.

**SATIB-SOVMA** "Satıb-sovmaq"dan *f.is.*

**SATIB-SOVMAQ** *f.* Hər nə var heçə-puça satmaq, dağıtmaq, korlamaq, axırına çıxmaq. *Mal-dövləti satıb-sovmaq.* – [Cənnətəli ağa:] *Heydərqulu, doğrudurmu ki, sən gedib, mədaxilin hamısını satıb-sovub gəlmisən?* N.Vəzirov. [Məsum kişi] *tələm-tələsik hər şeyi dəyər-dəyməzinə satıb-sovdu.* Mir Cəlal.

**SATIB-SOVURMA** "Satıb-sovurmaq"dan *f.is.*

**SATIB-SOVURMAQ** b a x **satıb-sovmaq**. *Ailə çətinliklə dolanırdı. Evin bütün şeylərini satıb-sovurmuşdular*. Q.İlkin.

**SATICI** *is.* Hər hansı bir şey, mal satan adam. *Bazar satıcılarla dolu idi. – Qonşum bazardakı satıcıları adbaad tanıyırdı.* S.Rüstəm. // Ticarət müəssisələrində, mağazalarda, dükanlarda və s.-də işləyən, alıcılara mal satan işçi. *Universamın satıcıları. – Çadır-mağazanın qabağına toplaşıb deyişən arvadların səsi satıcını təngə gətirdi*. B.Bayramov.

**SATICILIQ** *is.* Satıcı vəzifəsi, işi. *Qonşum mağazada satıcılıq edir.*

**SATIL** *is.* Su, süd və s. tökmək üçün armudu formada ağzı gen iri mis qab. *Dərhal xəlfə ağ qalaylanmış mis satıllarda şərbət, əlində gülabzən camaat ilə bir yerdə küçəyə çıxardı.* H.Sarabski.

**SATILCA** *is.* Balaca satıl. *Satılcanı şərbətlə doldurmaq*.

**SATILMA** "Satılmaq"dan *f.is.*

**SATILMAQ** "Satmaq"dan *məch. Axşam satılan* (f.sif.) *oğurluq maldan pristavın payı qumar oynadığı vaxt gətirilib özünə verilərdi.* Ə.Haqverdiyev. [Telli:] *Gözümün qabağında anamın birər nişanəsi və yadigarı olan xalçalarım üstümə gələcək arvada paltar alınmaq üçün satıldı*. S.Hüseyn.

**SATILMALI** *sif.* Satılmaq üçün olan, satlıq.

**SATILMAZ** *sif.* Satılmalı olmayan, satılmayan. // İşə getməyən. *Satılmaz mal.*

**SATIN: satın almaq** – 1) pulla almaq. *Taxılı çəki ilə satın almaq. – Əlbəttə, müftə mal harada idi, pul ilə satın alaq.* M.F.Axundzadə; 2) *məc.* pulla, rüşvətlə əldə etmək, öz tərəfinə çəkmək, öz iradəsinə tabe etmək. [Gültəkin Dövlət bəyə:] *Siz məni pulla satın almaq istəyirsiniz?* C.Cabbarlı. [Restoran şefi] *skripkaçıya böyük ehtiyacı olduğundan* [Məzlumu] *komendantdan satın aldı*. S.Vəliyev; 3) bir sıra isimlərdən sonra gələrək müxtəlif frazeoloji ifadələr düzəldilir; məs.: cənnəti satın almaq, davanı satın almaq.

◊ **Elə bil satın alıb** – bir şeyi həddindən artıq əzizləyən, qoruyan, ondan əl çəkmək istəməyən, onu özününkü hesab edən adam haqqında.

**SATINALMA** *sif.* Pulla alınmış, əvəzində pul verilmiş.

◊ **Satınalma qul (kimi)** *köhn.* – itaətkar, hüquqsuz, müti adam haqqında. [Rəhim:] *Məgər, Leyla xanım, görməyirsən, mən gecə-gündüz xanın qabağında satınalma qul kimi əlibağlı durmuşam?..* N.Vəzirov. [Yusifəli:] *Cənab Yavər, mən sənin satınalma qulunam.* P.Makulu.

**SATIŞ** *is.* 1. Satmaq işi, satma, satım.

2. Satış üçün qoyulmuş, ayrılmış, satılmaq üçün olan, satılan. *Satışda olan malları gözdən keçirmək.* – [Xərabati] *satış üçün əlində tutmuş olduğu kitabları uzadaraq onlara göstərər.* H.Cavid.

3. Satılma. *Bütün yol uzunu mənim dostum neft istehsal edilməsindən, satışından və bir də öz iki mühəndisindən danışırdı.* B.Talıblı.

**SATÍN** [*fr.*] Möhkəm parlaq pambıq parça. // Satindən tikilmiş. *Satin köynək. Satin tuman.*

**SATİNÉT** [*fr.*] Satinin nazik növü.

**SATÍRA** [*lat.*] 1. Cəmiyyətdəki mənfilikləri, eybəcərlikləri gülməli və kəskin şəkildə ifşa və təsvir edən bədii əsər. *C.Məmmədquluzadənin satiraları. – Vaqif yolunun davamçısı olan Zakir şerimizə həqiqi satira gətirmişdir.* A.Şaiq.

2. İfşaedici, acı, öldürücü gülüş. "*Molla Nəsrəddin*"*in gülüşü kəskin bir gülüş, öldürücü bir satira idi.* M.İbrahimov.

**SATİRÍK**[1] *sif.* Satiraya xas olan, satiraya aid olan, satira mahiyyətində olan. *Satirik komediya. Satirik məcmuə. – Satirik şeirlərdə Cəfər Cabbarlı böyük xalq şairi Ələkbər Sabirə oxşamağa çalışırdı.* M.Arif.

**SATÍRİK**[2] [*lat.*] *is.* İncəsənətin hər hansı sahəsində satira cərəyanının nümayəndəsi, satira yazan, satira müəllifi. *Satirik yazıçı. Satirik rəssam. – Geniş oxucu kütləsi böyük satiriki* "*Molla Nəsrəddin*"*in adı ilə tanımağa başladı.* M.İbrahimov.

**SATQI** bax **satış** 1-ci mənada.

**SATQIN** *sif.* Özünü, öz əqidəsini, məsləkini, heysiyyətini pula satan; şərəfsiz, alçaq, rəzil, xain, namərd. *Bəndalı Mərəzadə satqın bir qarının evində necə gecələməli olduğunu anasına danışdı.* Mir Cəlal. [Aslan Məzluma:] *Hələlik öz işindir. Ancaq sonralar belə satqın başın qiyməti ucuz olacaqdır.* S.Vəliyev. // İs. mənasında. [Nüşabə:] *Satqını sürüyün cıdır düzünə; Hər görən tüpürsün murdar üzünə..* A.Şaiq. *Niyə qara yaxır bu satqın bizə?* B.Vahabzadə.

**SATQINLIQ** *is.* Satqın adamın iş və hərəkəti; rəzillik, şərəfsizlik, namərdlik. [Adil Rəcəbə:] *Bəlkə yenə satqınlıq eləmək istəyirsən?* B.Bayramov.

**SATLIQ** *sif.* Satılmaq üçün olan, satılmalı olan, satılan. *Satlıq taxıl. Satlıq kartof. – Sağmal inək bizdə, satlıq yağ sizdə.* (Ata. sözü). [Xortdan:] *Bir yanda çuval-çuval buğda qoyulub, .. bir yanda satlıq qoyun və qaramal.* Ə.Haqverdiyev. ◻ **Satlığa qoymaq** – satmaq üçün ayırmaq, satmaq üçün qoymaq. [Məsumə Muxtara:] *Kaş borcun çıxaydı, ananın paltarını satlığa qoyaydın, ancaq başımıza bu oyunu gətirməyəydin.* B.Bayramov.

**SATMA** "Satmaq"dan *f.is.*

**SATMAQ** *f.* 1. Pul alaraq əvəzində bir şey vermək. *Şey satmaq. Mal satmaq.* – [Cahan:] *Mən arşınmalçının xalasıyam, özüm də qızlara, arvadlara mal satıram.* Ü.Hacıbəyov.

2. Satqınlıq etmək, xain çıxmaq, xəyanət etmək, ələ vermək. *Dostunu satmaq. Yoldaşını satmaq. Vətənini satmaq. – Əgər bu saat* [Əlyarovun] *başqa bir şofer rastına düşsəydi, açarları Teymurdan alıb ona verərdi.* "*Rədd ol, get, xozeynini satan şofer mənə lazım deyil!*" *– deyərdi.* M.Hüseyn. [Aslan Məzluma:] *Olmaya andımızı pozmaq, düşmənə təslim olmaq və bizi satmaq istəyirsən?* S.Vəliyev.

3. Bir sıra isimlərdən sonra gətirilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ağırlıq satmaq, namusunu satmaq, naz satmaq, yalan satmaq və s.

**SATÚRN** *is.* [*lat.*] 1. Günəş sisteminin planeti. *Süheyl səyyarəsi.*

2. Qədim Roma mifologiyasında səpin allahı.

**SAUNA** *is.* [*ing.*] Çox yüksək dərəcədə hərarəti olan xüsusi növ hamam.

**SAVA** *sif.* Öz vaxtında deyil, sonradan cücərən, gecyetişən (*faraş* əksi). [Gülşən:] *Gecikmiş balaca, sava lalələr yaqut kimi şəfəq saçırdı.* İ.Əfəndiyev.

**SAVAB** *is.* [*ər.*] İslam dininə görə pis deyil, yaxşı iş görmə (*günah* əksi). *Güman etməyin ki, Şeyx Şaban azan verməyinə muzd alırdı. Xeyr, əstəğfürullah azan verməyi məhz savab əməl hesab edərdi və əcrini qiyamətdə Allahdan gözləyirdi.* Ə.Haqverdiyev. [Gülnaz:] *Vay bizim halımıza ki, dünyada bir savab qazanmadıq.* T.Ş.Simurq. // Canlı dildə, ümumiyyətlə, yaxşı, xeyirli, xeyirxah iş mənasında işlənir.

◊ **Savab etmək (eləmək, qazanmaq)** – 1) dini baxımdan yaxşı, xeyirli bir iş görmək; 2) ümumiyyətlə, yaxşı, xeyirli bir iş görmək. *Heyran göz yaşı ilə sənə yazdı dərdini; Yazsan cavabını, edəcəksən böyük savab.* Heyran xanım. [Nəcəfalı:] *Gərək elə iş görəsən ki, el savabı qazanasan, bala!* B.Bayramov. **Savab yiyəsi olmaq** – b a x **savab etmək (görmək, qazanmaq)**. [Sultan bəy:] *Mənim də muzdum budur ki, savab yiyəsi olaram*. Ü.Hacıbəyov. **Savaba batmaq** – b a x **savab etmək (eləmək, qazanmaq)**. [Ağafan:] *Mirzə, savaba batdınız. Hacı kirə verməmək üçün bəhanə axtarırdı.* Mir Cəlal.

**SAVAD**[1] *is.* [*ər.*] Yazıb-oxumağı bacarma; yazı-pozu. [Mozalanbəy:] *Axı rusca savadım yoxdur*. Ə.Haqverdiyev. *Şagirdlərin savadı müxtəlif idi. Aramızda əsla savadı olmayanlar da var idi*. T.Ş.Simurq. □ **Savad almaq** – yazıb-oxumağı öyrənmək. **Savad vermək** – yazıb-oxumağı öyrətmək. [Bəhlul:] [Nənəmin] *sol əli anadangəlmə şikəst olduğu üçün atası, "bədbəxt qızın" halına acıyıb ona savad vermişdi*. B.Bayramov.

**SAVAD**[2] *is.* [*ər.*] *xüs.* Gümüşdən qayrılan şeylərin üzərinə salınan qara rəngli naxış.

**SAVADÇI** *is. xüs.* Savad ustası, gümüş şeylərə savad vuran, savadla bəzəmə ustası olan zərgər.

**SAVADLAMA** "Savadlamaq"dan *f.is.*

**SAVADLAMAQ** *f.* Gümüş şeylərin üzərinə qara naxışlar vurmaq.

**SAVADLANDIRILMA** "Savadlandırılmaq"dan *f.is. Əhalinin savadlandırılması*.

**SAVADLANDIRILMAQ** *məch.* Yazıb-oxumaq öyrədilmək.

**SAVADLANDIRMA** "Savadlandırmaq"dan *f.is.*

**SAVADLANDIRMAQ** *f.* Oxumaq və yazmaq öyrətmək, oxu-yazı öyrətmək. *Savadsızları savadlandırmaq*. – [İkinci qadın:] *..Savad kursları açıb tamam savadsız qadınları savadlandırarıq*. Ə.Haqverdiyev. *Firuzə bir neçə dəfə Həsəngilə gələrək Zəhranı savadlandırmaq istəmişdi.* M.İbrahimov.

**SAVADLANMA** "Savadlanmaq"dan *f.is. Köhnə ərəb əlifbasının çətinliyi geniş xalq kütləsinin savadlanmasına imkan vermirdi.* S.S.Axundov.

**SAVADLANMAQ** *f.* Yazmaq və oxumaq öyrənmək. [Almaz Yaxşıya:] *Əlində qazancın olar. Azad olarsan, adam olarsan, savadlanarsan.* C.Cabbarlı.

**SAVADLI**[1] *sif.* Yazıb-oxumağı bacaran. *Biçarə tacir məktubu əl-əl gəzdirib, heç bir kəs oxuya bilməyib, Gəncədə də ki savadlı molla tapmaq mümkün deyildir*. C.Məmmədquluzadə. // Qrammatik cəhətdən çox düzgün yazan və danışan. *Savadlı tələbə. Savadlı şagird*. – *Katibliyə savadlı adam olmadığından bu iş şəhərdən gələnin boynunda qaldı.* Mir Cəlal. // *məc. dan.* Hər hansı bir sahədə yaxşı biliyi, məlumatı olan; bilikli. *Savadlı həkim.* – *Mollayev savadlı adamlarla vuruşanda daha amansız olurdu.* M.Hüseyn. *Qadirin fikrincə Veys savadlı, bilikli adam olsaydı, sözünü belə qurtarardı.* Ə.Əbülhəsən.

**SAVADLI**[2] *sif.* Üstünə qara naxışlar çəkilmiş, savad vurulmuş gümüş şeylər haqqında.

**SAVADLILIQ** *is.* Savadı olma, yazıb-oxumağı bacarma.

**SAVADSIZ** *sif.* 1. Savadı olmayan, yazıb-oxumaq bilməyən. *İndi ölkəmizdə savadsız adam çətin tapılar.* – [İkinci qadın:] *..Savadsız qadınlar üçün savad kursları açıb tamam savadsız qadınları savadlandırarıq*. Ə.Haqverdiyev. *Xədicə savadsız bir qız idi.* S.Hüseyn.

2. *məc.* Bacarıqsız, qabiliyyətsiz, biliksiz; naşı. [Hüsaməddin:] *Mən qadınların ruhunu .. öyrənmək işində çox savadsızam.* M.S.Ordubadi. // Avam, cahil.

**SAVADSIZLIQ** *is.* 1. Savadsız olma, yazıb-oxumağı bacarmama; avamlıq, cəhalət. [Mehribanın] *nöqsanı yalnız savadsızlığı idi.* S.Hüseyn. "*Kəşkül*" *də* "*Əkinçi*" *kimi savadsızlıq və cəhalət əleyhinə çıxaraq, elm və mədəniyyətin yayılması uğrunda çarpışırdı.* M.İbrahimov. *Özünün iqrar etdiyinə görə tay-tuşları gecə kurslarında da olsa, oxuyub savadsızlıqlarını ləğv etdilər.* Ə.Vəliyev.

2. *məc.* Bacarıqsızlıq, qabiliyyətsizlik, biliksizlik, naşılıq.

**SAVÁNNA** [*isp.*] Tropik və subtropik zonalarda ot örtükləri.

**SAVAR** *is. k.t.* Vaxtından gec əkilən taxıl. *Onlar elə düşünürdülər ki,* "*Böyük düz*" [qonşu kolxoza] *verilməzsə, pambıq üçün də*

*torpaq bəs edər, savar səpilən gömgöy taxılı çevirib pambıq əkməzlər.* Ə.Əbülhəsən.

**SAVAŞ** *is.* 1. Müharibə, döyüş, vuruşma, dava. *Uzun sürdü qanlı savaş, xalqı ağır günlər aldı.* A.Şaiq. *Ən qanlı savaşlarda qorxu bilməyən... Qazan xan röyadan çox qorxardı.* M.Rzaquluzadə.

2. Söyüşmə, dalaşma, dava-dalaş. *Yaz gününün yağışı – ər-arvadın savaşı.* (Ata. sözü). [Gülşən:] *Biz söz dedik, savaş demədik ki. O ki qaldı hazırlığa, hər işimiz yerindədir.* Ə.Vəliyev.

**SAVAŞDIRMA** "Savaşdırmaq"dan *f.is.*

**SAVAŞDIRMAQ** *icb.* Bir-birinin üzərinə salışdırmaq, aralarına dava salmaq; vuruşdurmaq.

**SAVAŞQAN** *sif.* Dalaşqan, davakar, savaşmağı, dalaşmağı, dava salmağı sevən. *Savaşqan uşaq.*

**SAVAŞQANLIQ** *is.* Savaşmağı, dava salmağı xoşlayan adamın xasiyyəti.

**SAVAŞMA** "Savaşmaq"dan *f.is.* Savaş, dava-dalaş. *Savaşma daha da böyüyəcəkdi.* S.Vəliyev.

**SAVAŞMAQ** *f.* Dalaşmaq, vuruşmaq, söyüşmək, küsüşmək. *Dost dost ilə əbəs yerə savaşmaz; Sevənin sevəndən könlü bulaşmaz.* M.P.Vaqif. *Gahdan xoşluğunan, gah savaşınan; Köksünü açmağın nə damağı var?* Aşıq Ələsgər. *Dünənki hərb günündə də; Savaşanda ana torpaq; O dəhşətli cəbhələri; Mən burada gördüm ancaq.* B.Vahabzadə.

**SAVAY(I)** *qoş.* Başqa, qeyri. *Səndən savayı adamım yoxdur. Evdə uşaqdan savay adam yox idi. – Təsvir etdiyimiz Mirzə Mustafanın göstərdiyimiz sifətlərdən savayı bir başqa sifəti də var idi.* E.Sultanov. [Gülpəri:] *Ayrandan savay nəyim olacaqdır?* N.Nərimanov. *Başımı yavaşca qovzayıb yan-yörəmə baxdım. Heyvan sümüyündən və zibildən savayı bir şey görmədim.* Çəmənzəminli.

**SAY**[1] *is.* 1. Ədəd, rəqəm. *Sayı yadda saxlamaq. Sayı öyrənmək.*

2. Miqdar, kəmiyyət. [Həsən ağa:] *Şükürlər olsun, gəldikcə ziyalılarımızın sayı artır, onları bir göndər, yanıma gəlsinlər, bir söhbət edək.* Ə.Haqverdiyev. ☐ **Saya gəlməmək** – sayı çox olmaq, miqdarı, kəmiyyəti bilinməmək. *Dənizə bax, dənizə, saya gəlməz buruqlar; Suların altında da neft var, qara qızıl var.* S.Rüstəm. *Dedi: – Bahar əyyamıdır; Sevinclərim gəlməz saya.* N.Rəfibəyli. ...**sayı yoxdur,** ...**sayı-hesabı yoxdur** – saysızdır, çoxdur. *Qarışqanın sayı var idi, qoşunun sayı yoxdur.* "Koroğlu". [Hacı Murad:] *Qapısında nökər-qulluqçunun sayı-hesabı yoxdur.* S.S.Axundov.

3. *məc.* Sayılan, seçilən, hörmətli. *Sən ulduzsan, mən ayam; Say quşlardan mən sayam; Məcnun kimi gəzərəm; Leyli müştağındayam.* (Bayatı).

◊ **Saya almamaq** – b a x **saymaq** 4-cü mənada. *Amansız ölümü almayıb saya; Çıxdım qarşısına qara yellərin.* S.Rüstəm. *Yenidən girməkçin qızğın davaya; Onlar çətinliyi almayır saya.* M.Rahim. **Saya salmamaq** – b a x **saya almamaq**. *Dünyanı saya salmayırdı dəli şair; Dərin-dərin düşünərkən həyata dair.* S.Vurğun. [Xuduş:] *Bu boyda adamları da saya salmırlar.* İ.Əfəndiyev. **Saya-sana salmaq** – b a x **saymaq** 3-cü mənada. *Heyf ki, Musa dayının Təzə şəhər uşaqlarını saya-sana salmağı uzun çəkmədi.* Mir Cəlal.

**SAY**[2] *is.* Dənizdə, göldə, çayda gəmilər üçün təhlükəli olan dayaz yer. *Gəmi saya oturdu. – Çıxır gəmi karvanları necə dəryaya; Gedir böyük bir qürurla, oturmaz saya.* M.Rahim.

**SAYA** *sif.* 1. Bir rəngdə olan, birrəngli. *Saya parça. Saya gülməxmər.* // Bu parçadan tikilmiş. *Saya paltar. Saya kofta.* // Naxışsız, gülsüz. *Saya ləçək. Saya şal.* – [Rüstəm] *sətin köynəyi büzməli tumanın içinə salıb, üstündən göy saya jaket geymiş Tellini acıqlı-acıqlı süzdü.* M.İbrahimov.

2. Mürəkkəb olmayan, sadə. *Saya naxış. Saya ilgək vurmaq.*

3. Sadə. *Saya adam.*

**SAYAÇI** *is. ədəb.* Qoyun, quzu və keçi haqqında mahnı qoşan və oxuyan adam. *Sayaçı mahnıları. Sayaçı sözü. – Saya-saya sayadan; Yun gəlir qayadan; Sayaçıya pay verin; Mazlığı mayadan.* (Bayatı).

**SAYAD** b a x **səyyad**. *Sayadam, duraram mən; Boynumu buraram mən; Harda bir tərlan görsəm; Ona tor quraram mən.* (Bayatı).

**SAYAĞI** *qoş.* Sözə qoşularaq, onun ifadə etdiyi şeyə oxşarlığı bildirir: ...kimi, ...tək, ...bənzər, ...oxşar. *İlan sayağı qıvrılıb. Yarpaq sayağı bükülmək. Canan sayağı geyinmək.*

**SAYAQ**[1] *zərf* Bənzərlik bildirir: cür, kimi, tərzdə, vəziyyətdə, qaydada. *Paltarlarının hamısını usta Ağabala topladı, dolma bükülü sayaq bir fitəyə büküb qoydu səkiyə.* Çəmənzəminli. [Nəcminin] *on dörd yaşlı ikinci oğlu Şirin hələ bu yaşdan karikatura sayaq şəkillər çəkirdi.* Ə.Əbülhəsən. ☐ **Ayrı (özgə) sayaq** – başqa cür, ayrı cür. *Çünki qarı bildi bu keyfiyyəti; Özgə sayaq oldu onun niyyəti.* A.Səhhət. *Məşədibəyin və atalarının hər dəqiqə halını-əhvalını soruşduğu bu qonaq, deyəsən, ayrı sayaq adamdı.* M.Hüseyn. **Bir sayaq** – birtəhər, bir cür, bir növlə. *Bunların hamısına* [müxtəlif ağır işlərə] *yenə bir sayaq tab gətirmək olar, bunlar demək olar ki, dərdin yarısıdır.* F.Köçərli. **Bu sayaq** – bu cür, bu təhər, bu qayda ilə. [Əsgər:] *Yox, mən bu sayaq evlənmək istəmirəm.* Ü.Hacıbəyov. *İyirmi beş il bu sayaq bənnəlikdə çalışıb da*, [Kərbəlayı Əzim] *ad qazana bilmişdi.* T.Ş.Simurq. **Qabaqkı (əvvəlki, köhnə) sayaq** – əvvəllərdə (qabaqlarda, keçmişdə) olduğu kimi, keçmiş kimi. *..Həkim* [Molla Abbasın da] *üz-gözünə qabaqkı sayaq baxdıqda Molla Abbas birdən* "*pıqq*" *eləyib göyə tullanır..* C.Məmmədquluzadə. *Hər tərəfdə durur işlər elə əvvəlki sayaq.* Ə.Nəzmi. **Nə sayaq** – necə, nə cür, nə təhər. *Kassio dəsmalı tapıb çox heyrətə düşür ki, bu dəsmal nə sayaq və haradan onun otağına düşübdür.* F.Köçərli. *İndi mən bildim ki, qızların həyat məsələsi nə sayaq həll olunurmuş.* T.Ş.Simurq.

**SAYAQ**[2] b a x **sayıq** 2-ci mənada. [Halaypozan] *özü də elə sayaq yatardı ki, lap sərçə kimi*. "Koroğlu". *Çadırlar uyqudadır, atanlar orda sayaq; Gəray bəyin yanında yalnız Cəlaldır oyaq*. S.Vurğun. ☐ **Sayaq durmaq** – diqqətli olmaq, sayıq olmaq, ayıq olmaq. *Mənim göz olduğum sayaq durduğum dünyada; Mümkünmüdür səni salmamaq yada?* M.Rahim.

**SAYAQLAMA** "Sayaqlamaq"dan *f.is.*

**SAYAQLAMAQ** b a x **sayıqlamaq**. *Oğlan oyuna bir mərtəbədə aludə olmuşdu ki, gecə vaqiədə də oyundan sayaqlayırdı.* Ə.Haqverdiyev. *Xəstə sayaqlayır, hərarət içində çırpınıb dururdu*. M.İbrahimov. [Hümmət Həmzəyə:] *Sən də ağsaqqal əmin oğlu kimi görək nə sayaqlayacaqsan*. B.Bayramov.

**SAYALANMA** "Sayalanmaq"dan *f.is.*

**SAYALANMAQ** *f. məh*. Sağalmaq *Yara sayalanıb. – Nəzakət vaxtında, xublar çağında; Baxdım, yar yarası sayalanıbdı.* "Qurbani".

**SAYCA** *zərf* Say etibarilə, sayına görə; miqdarca, miqdarına görə. *Sayca çox. Sayca az dəstə.* – [Döyüşçülər] *kəndin sayca az və meşəyə qaçmış olan camaatını geri qaytardılar*. Ə.Vəliyev.

**SAYDIRMA** "Saydırmaq"dan *f.is.*

**SAYDIRMAQ** *icb.* 1. Saymağa, hesablamağa məcbur etmək, sayma işi gördürmək. *Pulları təzədən saydırmaq*.

2. *məc.* Saymağa, hörmət etməyə, hesablaşmağa vadar etmək. *Bir milləti saydırmaq üçün onun mədəni cəhətlərini göstərməlidir*. Çəmənzəminli.

**SAYƏ** *is.* [*fars.*] 1. Kölgə. *Sən bir ağacsan ki, ömründə heç kəs; Nə sayə görübdür, nə səmər səndən.* Q.Zakir. [Dərviş:] *Ruqiyyə əvəzində duman arasında sayə görürdüm..* A.Divanbəyoğlu. ☐ **Sayə salmaq** – kölgə salmaq, kölgələmək. *Qaşın qabağında sığallı birçək; Sayə salmış üzə şölə mübarək*. M.P.Vaqif.

2. *məc.* Himayə, mühafizə, qoruma. [Pərvizxan:] *Mərhəmətiniz artıq, lütfünüz ziyadə, sayəniz kəm olmasın*. M.S.Ordubadi. ☐ **Sayə salmaq** – himayə etmək, mühafizə etmək, kömək etmək, himayəsi altına almaq. *Şahlar şahı sayə salsın üstümə; Ələsgərtək bəxtiqara dolansın.* Aşıq Ələsgər.

3. **Sayəsində** şəklində – "nəticəsində", "səbəbilə", "köməyilə" mənalarında. *Müəllimlərin səyi və qeyrəti sayəsində çox qövm və tayfalar xoşbəxt olub ağ günə çıxıblar...* F.Köçərli.

◊ **Bu (o) sayədə** – bunun (onun) nəticəsində, səbəbilə, üzündən. *Qoy cahan elm ilə pürnur olsun; Vətən o sayədə məmur olsun.* A.Səhhət.

**SAYƏBAN** *is.* [*fars.*] *klas.* Üstü yarpaq, şax və s. ilə örtülü yer; çardaq, kölgəlik. *Göstərdi bir tərəfdə bir sayəban;* "*Otur burda, bu yer sənindir*" *– dedi.* A.Səhhət.

**SAYĞAC** *is.* 1. Bir şeyi hesablamaq üçün xüsusi quruluşlu cihaz, alət. *Elektrik* (*qaz*) *sayğacı* (*işlənən elektrikin, suyun, qazın miqdarını hesablayan cihaz*). *Taksi sayğacı* (*taksilərdə gedilmiş yolun məsafəsini və haqqını göstərən cihaz*).

2. Dördkünc çərçivədə köndələn millərə keçirilmiş yuvarlaq sümükcüklərdən ibarət sadə riyazi hesablamalar aparmaq üçün alət, çötkə. [Mədəd:] *Mən isə idarədə oturub sayğac danələrinin səsinə qulaq asmazdım.* Ə.Vəliyev. [Şahmar] *o biri otaqda sayğacını aram-aram şaqqıldadan hesabdarın yanına keçdi.* B.Bayramov.

**SAYĞI** *is.* 1. Hörmət, ehtiram, sayma, ehtiram etmə. [Birinci qulam:] *Çəkil ordan, nə sayğı bilməz adam*. H.Cavid.

2. Sayıqlıq, ehtiyat.

**SAYĞILI** *sif.* 1. Başqalarına sayğı göstərən, hörmət edən; sayan.

2. Sayılan, hörmətli, möhtərəm.

**SAYĞISIZ** *sif.* 1. Ehtiram göstərməyən, hörmət etməyən, hörmət gözləməyən, saymazlıq göstərən, saymaz. [Aydəmir heyrətlə gülərək:] *Bu sayğısız adamlara vaqonlarda gözlənilməsi lazım olan qaydaları anladınız, – deyə ağzından köpük saçır.* A.Şaiq. [Knyaz:] *Ən qaba insan; Ən sayğısız, ən qorxulu düşmən*. H.Cavid.

2. Ehtiyatsız, diqqətsiz, laqeyd, təhlükəni, qorxunu vecinə, saya almayan. *Zikirsiz mömini şeytan alladar; Sayğısız igidi düşmən alladar*. Aşıq Ələsgər.

**SAYĞISIZLIQ** *is.* 1. Ehtiramsızlıq, saya almama, saymazlıq.

2. Ehtiyatsızlıq, diqqətsizlik, saymazlıq, laqeydlik, fikir verməmə, aldırmama, vecinə almama. *Bir zamanlar təkcə gecələrin qaranlığından vahimələnən Ulduz, indi zülmət gecələrdə canavar kimi ağzını açıb od püskürən topların üstünə bir sayğısızlıq və həqarətlə getməkdə idi.* Ə.Məmmədxanlı.

**SAYXAŞ** *sif. dan.* Sakit, durğun, küləksiz. *Sayxaş hava.*

**SAYXAŞLIQ** *is. dan.* Sayxaş havanın vəziyyəti; sakitlik, durğunluq.

**SAYXAŞMA** "Sayxaşmaq"dan *f.is.*

**SAYXAŞMAQ** *f. məh.* Sayxaş olmaq, sakitləşmək. *Hava sayxaşdı.*

◊ **Ara sayxaşmaq** – b a x **ara**.

**SAYICI** b a x **hesablayıcı** 1-ci mənada.

**SAYIQ** *sif.* və *zərf* 1. Öz işində, hərəkətində ehtiyatlı, gözüaçıq, ayıq, oyanıq olan, sərvaxt. *Sayıq adam. – Hər cəbhədə ayıq, sayıq; Əsgər kimi durmalıyıq.* S.Vurğun. *Bizdən tələb edir quruluş; Belə sayıq yaşamağı.* M.Rahim. □ **Sayıq olmaq** – işində, hərəkətində ayıq olmaq, ehtiyatlı olmaq, sərvaxt olmaq. *Nəbi deyir: sayıq olun, yatmayın; Düşmənə havayı güllə atmayın.* "Qaçaq Nəbi". [Gözətçi:] *Ancaq ehtiyatlı və sayıq olmaq lazımdır.* H.Nəzərli.

2. *məc.* Dərin olmayan, yarıyuxulu, yarıayıq. [Göyçək] *sayıq yatmalı idi..* Ə.Əbülhəsən. *Reyhan tez-tez oyanaraq; Gecəni çox sayıq yatdı*. M.Dilbazi.

**SAYIQLAMA** 1. "Sayıqlamaq"dan *f.is.*

2. Huşunu itirmiş xəstənin, yaxud yuxuda olan adamın ağzından çıxan rabitəsiz, mənasız sözlər. *Hüseyn bu qayda ilə səhərə kimi yarı qızdırma, yarı sayıqlama içərisində yatdı.* S.Rəhman. *O, ətrafında zəif iniltilər və sayıqlamalar eşitdi.* Ə.Məmmədxanlı. *Səməndər bunun sadəcə sayıqlama olduğunu düşünüb güldü.* B.Bayramov. // Ümumiyyətlə, mənasız, məntiqsiz sözlər haqqında.

**SAYIQLAMAQ** *f.* 1. Huşunu itirmiş halda və ya yuxuda ikən rabitəsiz, aydın olmayan sözlər danışmaq. *Bütün gecəni sayıqlamaq. – Anaxanım gecə* [xanın] *yuxuda sayıqladığını .. dəfələrlə eşitmişdi*. Çəmənzəminli. *Birinci günlər Yaqut qızdırma içərisində sayıqlayır, yavaş-yavaş gözlərini açırdısa da, lakin heç kəsi tanımırdı.* Ə.Məmmədxanlı.

2. *məc.* Ağlına gələni danışmaq, rabitəsiz, məzmunsuz sözlər danışmaq; sarsaqlamaq. [Xacə Nizam:] *Kimdir bu? Neçin böylə sayıqlar?* H.Cavid.

**SAYIQLIQ** *is.* İşində, hərəkətində sayıq, ehtiyatlı, diqqətli olma; oyanıqlıq, ayıqlıq, sərvaxtlıq. *Sayıqlıq göstərmək.* – [Qurbanəli:] *Mən sayıqlığımı itirə bilmərəm*. M.İbrahimov. *Əhməddəki sinfi sayıqlıq və möhkəm iradə Yusifin fikrini alt-üst etmişdi.* Ə.Vəliyev.

**SAYILI** *sif.* 1. Sayı az olan, az təsadüf edilən, az görülən, tək-tək olan. *Bəzi hadisələr tarixdə sayılıdır*.

2. Sayı, miqdarı bəlli olan. *Sayılı kitablar*.

**SAYILMA** "Sayılmaq"dan *f.is.*

**SAYILMAQ** *məch.* 1. Hesablanmaq, sayı, ədədi bilinmək. *Kitablar sayılıb qurtardı. Siyahılar sayıldı.*

2. Hesab edilmək, bilinmək, ...kimi qiymətləndirilmək. [Rzaquluxan] *kəndlilərin içində azadiyyət sözləri danışdığı üçün başqa kənd sahibləri tərəfindən mənfur sayılırdı.* M.S.Ordubadi. *..Ərə gedib boşanmaq böyük bir qəbahət sayılırdı.* Çəmənzəminli. // ...kimi tanınmaq, hesab edilmək. *Sayılırsan vətən övladlarının bir fərdi; Vətən imdadinə iştə çağırır hər fərdi.* A.Səhhət. *Bibiheybət Bakının qədim neft rayonlarından biri sayılırdı.* M.Hüseyn. *Oğlan indi evin böyüyü sayılırdı.* S.Vəliyev.

**SAYIR-BAYIR** *sif.* və *zərf* Mənasız, məzmunsuz, rabitəsiz, məntiqsiz. *Sayır-bayır danışmaq. – Gülünün hərarəti çox artmışdı. O çapalayır, məzmunsuz və sayır-bayır danışırdı.* S.Rəhimov. [Şirəli] *köhnə əyyaşlar kimi sayır-bayır danışırdı*. M.Hüseyn.

**SAYQA** *is. zool.* Xortum kimi burnu və lirayaoxşar buynuzları olan gövşəyən qoşadırnaqlı heyvan, antilopun bir növü.

**SAYLAŞMA** "Saylaşmaq"dan *f.is.*

**SAYLAŞMAQ** *f.* Dayazlaşmaq (göl, çay, dəniz və s. haqqında).

**SAYMA** "Saymaq"dan *f.is.*

**SAYMAQ** *f.* 1. Rəqəmləri sıra ilə demək, sadalamaq, sanamaq. *Yüzə qədər saymaq. – Salman ona qədər saydı.* S.Rəhimov. [Yusif Hümmətə:] *Barmağınla sayırsan ki, filanı-filanı doldurmuşuq, yaxşı eləmisiniz*. B.Bayramov. // Miqdarını bilmək üçün hesablamaq. *Günləri saymaq. – Koroğlu da başladı pulu saymağa*. "Koroğlu". *..Bir qoca rus arvadı pullarını sayırdı.* Ə.Haqverdiyev. [Şahin Firəngizə:] *Onu demək istəyirəm ki, çox oxumuşam, hamısını bəlkə də saya bilmərəm.* B.Bayramov.

2. Bir-bir adlarını çəkmək, eyni cinsdən olan şeyləri adbaad sıra ilə demək; sadalamaq. *Kitabları saymaq. Uşaqları saymaq. – Sinədə yarələrim saydı, dedi, min cərrah; Səhv edib, hələ bu mindən birinin sayı deyil.* S.Ə.Şirvani. *..Saydığımız ağalar ən hörmətli üləma və sadat zümrəsindəndirlər*. C.Məmmədquluzadə.

3. *məc.* Ehtiram etmək, hörmətini saxlamaq, hörmət etmək; hesablaşmaq. *Sayanın quluyam, saymayanın ağası*. (Ata. sözü). *Əsgər indi səni sayacaq*. Ə.Əbülhəsən. *Quliyev bu adamların onu bir o qədər də saymadıqlarını başa düşürdü.* Ə.Sadıq.

4. Ehtiyat etmək, çəkinmək. [Nəbi:] *Qubernat, naçalnik gəlsə, saymaram; Düşmənin qanından içsəm, doymaram*. "Qaçaq Nəbi".

5. *məc.* Bilmək, hesab etmək. [Hacı Qara:] *Mənim sözlərimi zarafat sayırsınız?* M.F.Axundzadə. *Özünü yenidən dünyaya gəlmiş sayırdı.* Mir Cəlal. *Samirə mənim bu arzumu adi zarafatlarımdan biri sayırdı.* M.Hüseyn.

◊ **Saymaqla bitməz (qurtarmaz)** – həddindən çoxdur, sayı-hesabı yoxdur. *Saymaq ilə bitən deyil göstərdiyin hünərlər; Bülbül deyir bağçalarda dastanını hər səhər.* S.Vurğun.

**SAYMAMAZLIQ** b a x **saymazlıq**. [Zaman:] *Daha bu yerədək adamı saymamazlıq olmaz ki?* Ə.Haqverdiyev.

**SAYMAZ** *sif.* 1. Saymayan, məhəl qoymayan, vecinə almayan, diqqətsiz, laqeyd, başısoyuq. *Saymaz adam. // Zərf mənasında.* Saymazcasına, saymazyana, etinasız. *Saymaz keçmək. Saymaz cavab vermək.*

2. İkrahla baxılan, sayılmayan, avara, vecsiz. *Saymaz it adam tutar.* (Ata. sözü).

**SAYMAZCA** b a x **saymazcasına**. *Usta Qiyas saymazca və ağır-ağır evə girib göstərilən yerdə oturdu..* M.İbrahimov.

**SAYMAZCASINA** b a x **saymazyana**.

**SAYMAZLIQ** *is.* Etinasızlıq, hörmətsizlik, saymaz münasibət. *Ağca qarıya ərinin bu saymazlığı elə ağır gəldi ki, o dözməyib yerindən qalxdı.* Ə.Əbülhəsən.

**SAYMAZYANA** *zərf* Saymaz, saymazlıqla, etina etmədən, etinasızlıqla, saymazcasına. *Saymazyana danışmaq. Saymazyana ötüb getmək.* – [Məmməd bəy Səfərə:] *İndi biz də saymazyana düşərgəyə girərik, elə bilərlər ki, .. ot dalınca getmişdik.* Çəmənzəminli. [Əjdər] *..saymazyana geriyə nəzər salırdı.* S.Rəhman.

**SAYMAZYANALIQ** *is.* Saymazyana hərəkət, saymazlıq, etinasızlıq. *Saymazyanalıq etmək.*

**SAYRI** *sif. qəd.* Xəstə. *Qurbani der: könlüm bundan sayrıdır; Nə etmişəm, yarım məndən ayrıdır?* Qurbani.

**SAYRILMA** "Sayrılmaq"dan *f.is.*

**SAYRILMAQ** bax **sayrışmaq** 1-ci mənada. *Siyah zülfün buxaq altda qıvrılır; Ala gözlər can almağa sayrılır.* M.P.Vaqif. *Sən iti addımla qoşarkən iləri; Sayrılsın, gurlasın çaldığın kaman, hey!* M.Müşfiq.

**SAYRIŞMA** "Sayrışmaq"dan *f.is.*

**SAYRIŞMAQ** *f.* 1. Titrək, zəif işıq saçmaq, parlamaq, şəfəq buraxmaq. *Məğrib səmtində hələ ulduzlar göy üzündə sayrışırdı.* F.Köçərli. *Gecə idi, göydə ulduzlar sayrışırdı.* S.Rəhman. *Bir-birinə sığınan ulduzlar sayrışmağa başladı.* B.Bayramov. // *məc.* Bəlirmək, görünmək. *Ana! Bayaq gördüm Mehribanıtək; Üzündə sayrışır xalları tək-tək.* S.Vurğun. *Sənin gözlərinmi gənclik çağında; Yoxsa nərgizlərin sayrışıb oynar?* M.Müşfiq. *Payızın sonu olduğuna baxmayaraq, evlərin qarşılarındakı bağçalarda al-əlvan güllər, çiçəklər sayrışırdı.* M.Rzaquluzadə.

2. Qaçışmaq mənasında. *Naşı ovçu bərə bəklər, əylənər; Marallar sayrışar yollara doğru.* "Qurbani".

**SAY-SEÇMƏ** *sif.* Seçilən, müəyyən üstünlüyü olan; seçmə. *Koroğlu həmişə yazıq-yuzuğun, əlindən iş gəlməyən adamların dalınca ya özü gedər, ya da dəlilərin say-seçmələrindən göndərər.* "Koroğlu". *Aşıq Ələsgər .. gördü ki, bir-birinnən say-seçmə oğlanlardı.* "Aşıq Ələsgər".

**SAYSIZ** *sif.* və *zərf* Sayca, miqdarca çox olan, sayılması mümkün olmayan, həddən artıq çox, saysız-hesabsız. *Saysız qoşun. Saysız uşaq toplaşmaq. – Kameralarda saysız adam vardı.* M.Hüseyn.

**SAYSIZ-HESABSIZ** bax **saysız**. *Saysız-hesabsız adam. – .. Saysız-hesabsız soyğunçu tayfa atlarının ayağı altında torpaq .. bərkimişdi.* Ə.Məmmədxanlı. *Gül və bülbül haqqında saysız-hesabsız əfsanələr hamıya məlumdur.* M.Rzaquluzadə.

**SAYTAL** *sif. məh.* Boylu-buxunlu, enlikürək, bazburudlu; yekə, iri, sağlam. *Saytal adam.* – [Alo:] *Qanlı hər adama əl vurmaz. O həmişə saytal axtarar, – dedi.* S.Rəhimov. // İri, yekə, kök, ətli. *Saytal qoç.* – [Feyzi] *sürünü saymamışdan qabaq on baş saytal quzulu qoyun seçib öz alaçığının yanına ötürmüşdü.* B.Bayramov.

**SAZ**[1] *is.* [*fars.*] Mizrabla çalınan, armudvari çanağı olan simli xalq çalğı aləti. *Saz çalmaq.* – [Rəsul:] *Mənə bir saz verin, dərdimi sazla deyəcəyəm.* "Aşıq Qərib". *Sonra əlinə aldı qonağım bir qızıl saz; Qanadlandı, durmadı, bilməm neçin yerində.* M.Müşfiq.

**SAZ**[2] *sif.* [*fars.*] 1. İşlətmək üçün tam yararlı, hazır halda olan; sınığı, zədəsi, nöqsanı olmayan; yaxşı təmir olunmuş. *Saz maşın. Saz alət. Saz saat.* – [Xortdan:] *Bala, faytonun sazdımı?* Ə.Haqverdiyev. *Alınca xəbəri qaçmışdı birbaş; Çiynində saz tüfəng, beldə patrondaş.* H.K.Sanılı. ☐ **Saz eləmək (etmək)** – düzəltmək, qaydaya salmaq, uyğunlaşdırmaq. *Sən də, gözüm, Allaha baxıb zülmü az eylə; Peyvəstə könül yıxsan əgər, bir də saz eylə.* M.P.Vaqif. *Mən demənəm dərdüqəmim az eylə; Daim meylin meylim ilə saz eylə.* Q.Zakir. **Saz olmaq** – uyğun olmaq, bərabər olmaq, tay olmaq. *Zaman sənə saz olmasa, sən zamana saz ol.* (Ata. sözü). *Yara yar saz olmasa; Pünhanda tər-tər ağlar.* (Bayatı).

2. Möhkəm, qıvraq, sağlam, dözümlü. *Bədəncə saz. Canı-başı saz.* – [Muxtar] *Feyzini səsləyib iki saz at yəhərləməsini tapşırdı.* B.Bayramov. // Yaxşı, yerində. *Onu Taşauzda gördüm, kefi saz; Ətirli tağlardan qovun dərərkən.* S.Rüstəm. // **Sazdır** şəklində – yaxşıdır, düzgündür, qaydasındadır, yerindədir mənalarında. *Demək ki, keyfiniz sazdır.* M.S.Ordubadi. [Süleyman:] *Şükür Allaha, hər şey öz yerində sazdır.* Ü.Hacıbəyov. [Aslan starşinaya:] *Hər şey öz qaydasındadır, maşın sazdır.* S.Vəliyev.

**SAZAQ** *is.* Bərk soyuq, şaxta. *Sazaq adamın əl-ayağını kəsirdi.* S.Rəhimov. – *Qar yağırmı? – Elə yağır... sazaq qılınctək kəsir.* Ə.Cəmil. // Quru soyuq külək. [Həcər:] *Gorusun düzündə qopubdur sazaq...* "Qaçaq Nəbi". *Qaranlıq qatılaşır, əl-ayaq çəkilir, gündüz adama xoş gələn sərinlik sazağa çevrilirdi.* Mir Cəlal. *Şər qarışır, sazaq başlayırdı.* İ.Hüseynov.

**SAZAQLI** *sif.* Kəskin küləyi, sazağı, soyuğu olan; şaxtalı. *Sazaqlı hava. – Sazaqlı bir sabah idi, yel adamı kəsirdi.* Çəmənzəminli.

*Quru sazaqlı bir gündə Novruz yaş əlcəklərini topun qızmış lüləsi üstündə qurudurdu.* R.Rza. *Səhər tezdən sazaqlı qış gününün yenicə gözünü açdığı dəqiqələrdən* [Ağabala] *gəlib laboratoriya qabağında* [Reyhanı] *gözlədi*. Mir Cəlal.

**SAZAN** *is. zool.* Əsasən qamışlıq, ya durğun şirin sularda yaşayan, iri pulları olan balıq növü.

**SAZANDA** *is.* [*fars.*] *köhn.* Çalğıçı. *Xan uşaqları Keçiliyə həm ova, həm də kefə gəldiklərindən yanlarınca qrammofon, xanəndə, sazəndə və bolluca araq-çaxır gətirmişdilər*. E.Sultanov. *Bir az da sazəndə, zurnaçı çalsın; Ruhunuz burada ləzzət də alsın.* H.K.Sanılı. *Xanəndə və sazəndələr isə çalğı taqımını buraxıb bir tərəfə gedərlər.* H.Cavid.

**SAZANDAR** bax **sazanda**. [Pəri:] *Anam sazandar və lazımlı şeylərin hamısını müheyya edib, toy bu günlərdə başlanasıdır.* C.Cabbarlı. *Qurtardı dəsgahı zurnaçı Qazar; Götürdü tarını sonra sazandar*. H.K.Sanılı. *Cunalı bir xanım çıxdı eyvana; Baxdı sazandara soyuq, bigana.* M.Rahim.

**SAZBƏND** *is.* [*fars.*] *köhn.* Saz bağlayan, saz qayıran usta. *Qəmbər onu apardı sazbəndin yanına*. "Abbas və Gülgəz".

**SAZÇALAN, SAZÇI** *is.* Saz çalan çalğıçı. *Sazçalan gözəl bir aşıq mahnısı çaldı. Sazçı qızlar ansamblı*.

**SAZİŞ** *is.* [*fars.*] 1. Qarşılıqlı razılığa gəlmə, qarşılıqlı razılıq, anlaşma, fikir birliyi, həmrəylik, birlik. *Məişət ilə məktəbin mabeynində əsla ittifaq və saziş yoxdur.* F.Köçərli.

2. Müqavilə. *Beynəlxalq sazişlər. Sazişi pozmaq. Sazişə riayət etmək.* ☐ **Saziş bağlamaq** – bir məsələ haqqında danışıq aparıb razılığa gəlmək, müqavilə bağlamaq.

◊ **Saziş etmək (eləmək)** *köhn.* – uyğunlaşmaq, ümumi dil tapmaq, düzəlişmək, uzlaşmaq, ünsiyyət tapmaq. *Ol gül üzardə ərəqin xoş səfası var; Türfə budur ki, saziş edər atəş ab ilə.* Q.Zakir. *O vaxt acıqlı, qaş-qabaqlı və mütəkəbbir müəllimlər ilə saziş eləmək doğrudan da ən çətin məsələlərdən birisi idi.* F.Köçərli.

**SAZİŞÇİ** *is.* Sinfi düşmənlə saziş, barışma, uzlaşma siyasəti aparan adam. // *məc.* Razılaşma, güzəşt tərəfdarı.

**SAZİŞÇİLİK** *is.* Sinfi düşmənlə uzlaşma, barışığa gəlmə, ona güzəştə getmə; sinfi düşmənlə barışma siyasəti.

**SAZLAMA** "Sazlamaq"dan *f.is.*

**SAZLAMAQ** *f.* Saz hala salmaq, düzəltmək, təmir edib işləmək üçün hazır hala salmaq. *Maşınları sazlamaq.* // Hazır vəziyyətə gətirmək. *Nəbi* [Məmmədəli bəyi] *vurmaq istəmirsə də, amma yenə keçmişi yadına salıb aynalını sazlayır*. "Qaçaq Nəbi". *Tez aç qatarını, sazla tüfəngi; Başlayaq könlümüz sevdiyi cəngi*. H.K.Sanılı. // Qaydaya salmaq, sahmana salmaq, hazırlamaq, qayırmaq. [Hacı Həsən:] *Kabla Fatma, dəxi durmaq vaxtı deyil, ev-eşiyi sazla*. C.Məmmədquluzadə. [Arvad:] *Hovuzun başında, kölgədə xalça salaram, samovarı sazlayıb qoyaram hovuzun başına, yaxşı çay dəmlərəm.* E.Sultanov. *O, maxorka papiros sazladı, səngərin rütubətli divarına söykənərək .. papirosunu dumanlatmağa başladı.* H.Nəzərli. // Təşkil etmək, düzəltmək. *O vaxt mən görürdüm ki, bu on səkkiz manat qəzetə üçün xüsusi bir mətbəə sazlamağa sərf olunur.* C.Məmmədquluzadə.

**SAZLANMA** "Sazlanmaq"dan *f.is.*

**SAZLANMAQ** *f.* Saz hala gəlmək, düzəlmək, sahmana düşmək, hazırlanmaq.

**SAZLAŞMA** "Sazlaşmaq"dan *f.is.*

**SAZLAŞMAQ** *f.* Saz olmaq, yaxşılaşmaq; işi, vəziyyəti, sağlamlığı yaxşı halda olmaq.

**SAZLIQ** *is.* Saz şeyin halı, vəziyyəti. *Aqreqatın sazlığı. Motorun sazlığı*. // Sağlamlıq, canı-başı saz olma.

**SE** "S" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**SEÁNS** [*fr.*] Bir işin icrasının arasıkəsilmədən davam etdiyi müddət, vaxt. *Kinoya gündüz seansına bilet almaq. Masaj seansı.* – *Saat on birdə başlanan seansa qalmaq olmazdı.* M.Hüseyn. *Özünümasajlama seanslarının hər biri sığallama ilə başlanır və sığallama ilə qurtarır.* Ə.Babayev.

**SEÇİCİ** *is.* Seçkidə iştirak edən, yaxud seçkidə iştirak etməyə hüququ olan adam. [Katib] *qısa bir çıxış etdikdən sonra seçicilərin görüşünə gəlmiş namizəd barəsində də bir neçə kəlmə deyib, danışmaq üçün sözü Cahangirova verdi*. S.Qədirzadə.

**SEÇİLƏN** *f.sif.* 1. Seçki nəticəsində seçilmiş. *Seçilən namizədlər.* // İs. mənasında. *Akademiyaya seçilənlər. Seçilənlər arasında cavanlar çoxdur.*

2. Nəzərə çarpan, fərqlənən, fərqləndirilən, başqalarından ayrılan. *Firəngizin qaşları tünd-qara deyildi, onda güclə seçilən qızılı bir parıltı nəzərə çarpırdı.* B.Bayramov.

**SEÇİLMƏ** "Seçilmək"dən *f.is.*

**SEÇİLMƏK** *məch.* 1. Səsvermə nəticəsində üstünlük almaq. *İclasa sədr seçilmək.*

2. Hər hansı xüsusiyyətinə, keyfiyyətinə və s.-yə görə başqalarından fərqlənmək, ayrılmaq. *Qız ala gözləri ilə rəfiqələrindən seçilirdi. – Kamran bu barədə bizim hamımızdan seçilirdi.* M.Hüseyn.

3. Nəzərə çarpmaq, görünmək. *Kəndin evləri ağaclar içində güclə seçilirdi.* H.Seyidbəyli.

**SEÇİLMİŞ** 1. *f.sif.* Səsvermə nəticəsində üstünlük verilmiş, intixab edilmiş. *Qurultaya seçilmiş nümayəndələr.*

2. *sif.* Çap edilmək üçün ayrılmış və bəyənilmiş. *M.F.Axundzadənin seçilmiş əsərləri. A.Şaiqin seçilmiş əsərləri.*

**SEÇİM** *is.* 1. Seçib götürmə. *60-cı illərdə .. yazıçılar indi mövzu seçimində, yaradıcılıq axtarışlarında nisbətən sərbəst idilər.* İ.Qasımzadə.

2. Çeşid, assortiment.

**SEÇKİ** *is.* Hər hansı bir vəzifəni yerinə yetirmək üçün səsvermə yolu ilə deputat və s. seçmə (bu mənada əsasən cəmdə işlənir). *Hamı seçkilərə! – On səkkizi tamam olub, on doqquza girəcək o; Sabah bizim seçkilərdə ilk səsini verəcək o.* N.Rəfibəyli.

**SEÇKİQABAĞI** *sif.* Seçkilərin yaxınlaşması ilə əlaqədar olan, yaxınlaşan seçkilər şərəfinə olan, seçkidən qabaq olan. *Seçkiqabağı yığıncaqlar. Keçən gün seçkiqabağı məni seçicilər arasında kütləvi iş aparmaq üçün Xıdırlıya göndərdilər.* S.Rəhman.

**SEÇKİLİ** *sif.* Seçki ilə olan, seçilən. *Seçkili vəzifə.*

**SEÇMƏ[1]** 1. "Seçmək"dən *f.is.*

2. *sif.* Oxşarları, bənzərləri arasında ən yaxşısı, ən əlası, ən gözəli, ən xoşa gələni; əla, ən yaxşı. *Seçmə üzük. Seçmə xalça. – Ağır sandıq seçmə parçalarla dolu idi.* Mir Cəlal.

3. *sif.* Ən hörmətli, ən görkəmli, ən seçilmiş, ən sayılan. *Toya seçmə adamları çağırmaq.* – [Bəhlul:] *..Mərziyənin xətrinə mən də çox yerə seçmələr* (is.) *sırasında dəvət edilirdim.* B.Bayramov.

4. *is. biol.* Canlı təbiətin inkişafı prosesində həyatın dəyişən şəraitinə ən çox uyğunlaşmış orqanizmlərin davam gətirib yaşaması. *Beləliklə, mühit amilləri şəraiti ilə əlaqədar olaraq seçmə nəticəsində camışlarda tənəffüs* (*südlük*) *tipi formalaşmışdır.* A.Ağabəyli. // Seleksiya. [Qarabağ atı] *xalqın uzun əsrlər boyu apardığı yaradıcılıq işi nəticəsində, xalq seçməsi* (*selleksiyası*) *nəticəsində yaranmışdır.* "Qarabağ atı".

5. *sif. məc.* Gözəl, xoş, ürəyəyatan. *Birinə göz edirdi, bəzisinə gülümsünürdü və kimisinə də seçmə bir kompliment deyib nəzərini özünə cəlb edirdi.* Çəmənzəminli.

**SEÇMƏ[2]** *is.* Saçma, qırma. *Məni oğru bilib seçməni qarnıma doldurar.* Mir Cəlal.

**SEÇMƏK** *f.* 1. Hər hansı bir əlamətinə görə çoxları arasından birini bəyənib ayırmaq, ona üstünlük vermək. *Zövqünə görə parça seçmək. Qız seçmək. – Qızılgülü biçmişəm; Üstündə and içmişəm; Min gözəlin içindən; Bircə səni seçmişəm.* (Bayatı). [Cahan:] *Vallah, gedərəm, dolanaram, gəzərəm, baxaram, bəyənərəm, seçərəm, bir qız alaram ki, adam baxanda ağlı gedər.* Ü.Hacıbəyov.

2. Müəyyən bir şeyə, sənətə, işə və s.-yə daha çox maraq göstərmək, onu daha üstün tutmaq, üstünlük vermək. *Mühəndis sənətini seçmək. Müəllimliyi seçmək.*

3. Yaxşını pisdən ayırd edə bilmək. *Mey tökərdin, içərdik; Xeyri, şəri seçərdik; Bir əkər, bir biçərdik; Biz qardaş deyilmiyik?* Ə.Cavad. [Balaxanım Dadaşı hədələdi:] *Bu iki gözün o qazamatın bir dar deşiyindən işıldayanda baxarsan, adamı seçərsən, tanıyarsan.* S.Rəhimov.

4. Müəyyən vəzifəni, tapşırığı yerinə yetirmək üçün səsvermə yolu ilə bir və ya bir neçə şəxsə üstünlük vermək. *Prezidium seçmək. İclasa sədr seçmək. Qurultaya nümayəndələr seçmək.* – [Tələbə:] *Məni ictimaiyyət dərnəyinə sədr seçdilər.* Qantəmir.

5. Müəyyən bir işi yerinə yetirmək üçün gün, vaxt, saat ayırmaq, təyin etmək. *Müza-*

*kirə üçün şənbə gününü seçdilər. Seminar üçün həftənin birinci gününü seçdilər.*

6. Müəyyənləşdirmək, təyin etmək, ayırd etmək, bir-birindən ayırmaq. *Açılan güllələrin haradan, kimə atıldığını seçmək də çətin idi.* Mir Cəlal. [Vahid:] *Lakin* [anamın] *oxuması ilə ağlamasını seçmək çətin idi.* B.Bayramov.

7. *məc.* Görə bilmək, görüb fərqləndirmək. *Uzağı seçmək. Yazını seçə bilmədim. – Diqqət ilə baxıb tələni seçdi; Yavuğa düşməyib uzaqdan keçdi.* Q.Zakir.

◊ **Gözü seçməmək** – b a x **göz**. [Mozalan bəy:] *Ancaq "Molla Nəsrəddin" qəzetinin yazısını gözüm əməlli seçmir.* Ə.Haqverdiyev. *Maya kitabı aldı, lakin oturduğu yerdə işıq az olduğundan gözü hərfləri seçmədi.* M.İbrahimov.

**SEÇMƏ-SEÇMƏ** *sif.* Ən yaxşı, ən seçilmiş. *Məclisə seçmə-seçmə adamlar gəldilər.* – [Mehdiqulu:] *Kəndin seçmə-seçmə oğlanlarını uşaq kimi iclasdan bayıra tökürəm.* Mir Cəlal.

**SEGAH** *is.* [*fars.*] *mus*. Azərbaycan klassik muğamlarından birinin adı. *Məclisin dalından kamança səsi eşidilir. Kamança segah çalır.* Ə.Haqverdiyev. *Dodaqaltı segah deyən qoca bənnalar; Sal daşlardan təməl qoyur, divar hörürdü.* Ə.Cəmil.

2. *tar.* Orta əsrlərdə Qərbi Avropada: eyni sənətlə məşğul olan şəhər sənətkarlarının təşkilatı.

**SEHR** *is.* [*ər.*] 1. Köhnə mövhumi təsəvvürlərə görə, guya insanlara və təbiətə təsir yetirməyə qadir olan ecazkar üsullar: ovsun, cadu, gözbağlayıcılıq. [Müsyö Jordan:] *Əlbəttə sehrdir, mat qalmalı işdi, bir türfətüleyndə qəflətən Parij xarab olubdur.* M.F.Axundzadə.

2. *məc.* İnsanı heyran edən hünər, məharət, qüvvə. *Arzulardan arzu doğur... Yoxdur sonu arzunun; Bağlanmışdır məna dolu; Sehrinə hər kəs onun.* N.Xəzri.

**SEHRBAZ** *is.* [*ər.* sehr və *fars.* ...baz] Sehrbazlıqla məşğul olan adam; ovsunçu, gözbağlayıcı. *Bu sehrbaza zirək, sağlam, gənc bir köməkçi lazımdı.* S.Vəliyev.

**SEHRBAZLIQ** *is.* Sehrbazın işi, məşğələsi, ovsunçuluq, gözbağlayıcılıq.

**SEHRKAR** *sif.* [*ər.* sehr və *fars.* ...kar] 1. B a x **sehrbaz**. [Əbülhəsənbəy:] *Ah, bu qız nə qədər sehrkar bir qız imiş.* M.S.Ordubadi.

2. *məc.* Məftunedici, füsunkar, fövqəladə gözəl. *Doğrudan da bu saat Qaraş və Mayanın üzündə ürəklərinin dərinliklərindən qalxan həm sehrkar bir cazibənin, həm də xoş bir səadətin işıqları oynayırdı.* M.İbrahimov.

**SEHRKARLIQ** *is.* 1. B a x **sehrbazlıq**.

2. *məc.* Məftunedicilik, füsunkarlıq, fövqəladə gözəllik. *Qılınc çəkdi hüsnün sehrkarlığı; Xan danışa bilmir, susur lal kimi.* B.Vahabzadə.

**SEHRLƏMƏ** "Sehrləmək"dən *f.is.*

**SEHRLƏMƏK** *f.* 1. Ovsunlamaq. *Artıq ikinci dəfə idi ki, maral* [ovçunu] *bu cür sehrləyirdi.* Ə.Məmmədxanlı.

2. *məc.* Məftun etmək, valeh etmək. [Məzlum Aslana:] *Skripka məni sehrlədi və onu bağrıma basıb çalmağa başladım.* S.Vəliyev. *Dünənə-srağagünə kimi hamının nəzərində bir "ana uşağı" olan Şahpəri birdən-birə Yusifi sehrləmişdi.* B.Bayramov.

**SEHRLƏNMƏ** "Sehrlənmək"dən *f.is.*

**SEHRLƏNMƏK** *məch.* 1. B a x **ovsunlanmaq**. [Ayna] *artıq tamamilə sehrlənmişdi.* Ə.Məmmədxanlı.

2. *məc.* Valeh olmaq, məftun olmaq, vəcdə gəlmək. *O bu ilk dialoqda Hüseynin füsunkar səsindən sehrlənmişdi.* S.Rəhman.

**SEHRLİ** *sif.* 1. Ovsunlu, ovsunlanmış, sehrlənmiş (nağıllarda). *Sehrli xalat. Sehrli papaq.* // *məc.* Əsrarəngiz, fantastik, sanki xəyal aləmində cərəyan edən. [Sənubər] *layihəni unudub dumanlı, sehrli bir aləmlə qovuşdu, xəyallarla əlləşməyə başladı.* B.Bayramov. [Teymur:] *Göstər bizə o sehrli çeşməni.* M.Seyidzadə.

2. *məc.* Füsunkar, valehedici, cazibədar.

**SEX** [*alm.* seche] 1. Sənaye müəssisəsinin, istehsal prosesinin müəyyən sahəsilə məşğul olan şöbəsi. *Sex ustası.* – [Lövhədə] *..hər sexin gündəlik işləri haqqında məlumat yazılıb asılırdı.* Ə.Sadıq. *Neçə gün idi ki, onların zavodu yeni bir sexi işə salmağa hazırlaşırdı.* H.Seyidbəyli. // Belə şöbənin yerləşdiyi bina. *Ehtiyat xala .. ipək fabrikində, boyaq-naxış sexində çalışırdı.* Mir Cəlal.

**SEKÁM** *is*. [*fr.*] Rəngli televiziyanın yaddaşlı ardıcıl sistemi.

**SEKRÉSİYA** [*lat.* secretio – ifraz] *fiziol*. Vəzilərin orqanizmin fizioloji fəaliyyətinə lazım olan şirələri hazırlayıb ifrazetmə prosesi.

**SEKRÉT** [*lat.* secretus – ayrılmış] *fiziol.* İnsan və heyvan bədənində vəzilərin hazırladığı maddə (mədə şirəsi, tüpürcək və s.).

**SEKRETÉR** [*fr.* secretaire] Üstündə yazı yazmaq üçün açılıb-örtülən qapağı (taxtası) və kağız və s. qoymaq üçün gözləri olan yazı stolu növü və ya şkaf.

**SEKS** *is.* [*lat.*] Kişi və qadın arasında fiziki yaxınlıq.

**SÉKSİYA** [*lat.* sectio – bölmə] 1. Bir idarənin, təşkilatın, cəmiyyətin və s.-nin şöbəsi və ya yarımşöbəsi; bölmə. *Univermağın hazır paltar seksiyası*. – [Tələbə:] *Biologiya elminə maraqlandığımdan təbiyyat şöbəsinin bioloji seksiyasında oxumağa başladım.* T.Ş.Simurq. // Xüsusi məsələləri müzakirə etmək üçün qurultayda, konfransda ayrılan bölmələrdən biri. *Konfransın seksiyalar üzrə işi.*

2. *tex.* Qurğunun, tikilinin və s.-nin bir sıra detallardan, hissələrdən ibarət olan hissəsi; blok. *Boru kəmərinin seksiyaları. Evin seksiyaları. – Nov sistemi ayrı-ayrı seksiyalarla məhlulun cərəyanı kəsilmədən təmizlənir*. S.Quliyev.

**SÉKSTA** [*lat.* sexta – altıncı] *mus.* 1. Diatonik qammanın altıncı pilləsi.

2. Diatonik qammanın birinci pilləsi ilə altıncı pilləsi arasında fasilə.

**SÉKTA** [*lat.* secta – nəzəriyyə, məktəb] Hakim dindən ayrılmış dini icma; təriqət.

**SEKTÁNT** [*lat.*] Təriqətçi.

**SEKTOR** *is*. [*lat.*] Bölmə, şöbə, sahə.

**SEKUNDÁNT** [*lat.* secundans (secundantus) – köməkçi] 1. *köhn.* Dueldə iştirak edənlərdən hər birinin şahidi və vasitəçisi. [Silvio:] *Üç sekundantımla birlikdə təyin edilmiş yerdə dayanmışdım*. Puşkindən. [Hüseyn:] *Qardaşlar, buraya zəhmət çəkin, siz burada bizim sekundantımız olun*. Ə.Haqverdiyev.

2. *idm.* İdman (boks, şahmat) yarışı iştirakçısının vasitəçisi və köməkçisi.

**SEL** *is.* [*ər.*] 1. Güclü yağmurlardan və ya əriyən qarlardan əmələ gəlib, qarşısına gələn nə varsa alıb aparan su daşqını; daşqın. *Yağışdan sonra güclü sel başladı. – Dağlardan axan sellər alaçıqlara dolub, bəzilərini yumalayıb aparır.* S.S.Axundov. *Haray çəkib gəlir bahar; Daşır sellər, aşır sular.* R.Rza. *Dağlara səs düşsün, çöllərə səda; Gurlayan sellərin dinlə səsini.* N.Xəzri. ☐ **Sel kimi** – müqayisələrdə: çoxluq, bolluq bildirir. *Qan sel kimi axır. Pul sel kimi başından tökülürdü. – Eşşək qulaqlarını sallamış, xamuş durmuşdu, Əhməd də göz yaşlarını sel kimi axıdaraq yalvarmağında davam edirdi.* B.Talıblı. *Camaat, arvadlı-kişili, sel kimi axıb gəlirdi*. B.Bayramov.

2. *məc.* Arasıkəsilmədən hərəkət edən insan kütləsi, izdiham, axın haqqında. [Əbülhəsən bəy:] ..*Sən bu selin qarşısında dura bilməyəcəksən.* M.S.Ordubadi.

3. *xüs.* Bir yerdən çıxan maqnit, işıq, qaz və s. kütləsi. *İşıq seli. Qaz seli.*

**SELAB** *is.* [*ər.* seyl və *fars.* ab] 1. Sel suyu. *Dağdan selab gəlir*. – [Şahin:] *Görəsən, selabda deyilik ki?* B.Bayramov.

2. Selin axarkən yuyub əmələ gətirdiyi dərə, oyuq, arx; selin açdığı yol. *Dərin selab. Dayaz selab. – Bu zaman Mehdigil* [kişini] *süpürüb tutdular. Qabaqlarına qatıb selabnan yuxarı çıxartdılar.* "Qaçaq Nəbi". *Dəvəboynu deyilən dağın ətəyindəki iki selab üzərindən də kiçik körpülər salınmasına başlanmışdır.* İ.Əfəndiyev.

**SELBASAR** *is.* Sel suyu ilə sulanan yerlər, selin basdığı yerlər.

**SELÉKSİYA** [*lat.* selectio – seçmə] Heyvan cinsləri və ya bitki növlərini yaxşılaşdırma, habelə süni seçmə və ciftləşdirmə yolu ilə yeni heyvan cinsləri və bitki növləri yetişdirmə. *Seleksiya işlərinin xalq təsərrüfatı üçün böyük əhəmiyyəti vardır.* // Həmin işin nəzəriyyə və praktikası.

**SELEKSİYAÇI** *is.* Seleksiya mütəxəssisi, seleksiya ilə məşğul olan.

**SELÉN** *is*. [*yun.*] Kimyəvi element.

**SELİK** *is.* Bəzi heyvan və bitki hüceyrələrinin ifraz etdiyi suvaşqan maddə. *Balıq bədəninin səthi xüsusi sürüşkən seliklə örtülü olur.* Y.Əbdürrəhmanov.

**SELİKLİ** *sif. anat.* Seliyi olan, selik ayıran. *Selikli qişa.*

**SELİKVARİ** *sif.* Seliyəoxşar, selik kimi. *Selikvari maddə.*

**SELİNTİ** *is.* 1. Selin yuyub apardığı yer, selin yatağı, selin açdığı yol. *Selinti yerlərin və çayların üstündən yeni düzülən körpülər keçirilirdi.* S.Rəhimov.

2. Selin özü ilə gətirdiyi ağac, kol, kötük, çör-çöp və s.

**SELİYƏOXŞAR** b a x **selikvari**.

**SELKUPLAR** *cəm* Krasnoyarsk ölkəsində və Tomsk vilayətində yaşayan şimal xalqı.

**SELLƏMƏ** 1. *is.* Böyük əkin sahələrinə sel kimi axıdılan su. *Xanpərinin sahəsi selləmə sulandığı üçün isti günlərdə dərhal quraqsıyırdı.* Ə.Vəliyev.

2. *sif.* Güclü yağış, şiddətli yağmur, leysan yağış. [Sevdim kişi:] *Havalar düzəlir, ay uşaq, Allah eləyəydi, bir selləmə* (z.) *yağaydı.* Ə.Vəliyev. *Qoşqar qış aylarında adamın qurşağına çıxan qalın qarı, yazda tez şaqqıldayan səmanı, selləmə yağışları .. lap körpəlikdən sevirdi.* İ.Hüseynov. // İs. mənasında. *Birdən selləmə başladı, iri yağış damcıları evlərin pəncərələrinə, küçələrin səkilərinə çırpıb, bütün şəhərə qəribə bir uğultu saldı.* H.Seyidbəyli.

**SELLƏMƏK** *f.* Selləmə üsulu ilə suvarmaq.

**SELLƏNMƏ** "Sellənmək"dən *f.is.*

**SELLƏNMƏK** *f.* Sel kimi axmaq, selə çevrilmək. *Gecə-gündüz, vaxtbivaxt ağlaram; Çeşmim yaşı Ceyhun olur, sellənir.* Qurbani. *Yağ, yağışım, sellənərək; Sırmalanıb tellənərək!* M.Müşfiq.

**SELLİ** *sif.* Çox sel olan; çox yağışlı, yağmurlu, sulu. *Selli aylar. – Yazın oğlan vaxtı, selli çağları; Qanıq ilə Qavrı, bir də dəli Kür; Birləşib üçü də, uçurur, tökür.* H.K.Sanılı.

**SELLİK** *is.* Selin yuyub gətirdiyi qum, xırda daş, ağac parçaları və s.; selinti.

**SELLİ-SULU** b a x **selli**.

**SELLOFÁN** [*lat.* cellula – hüceyrə və phanos – açıq, şəffaf] Sellülozdan hazırlanan nazik, şəffaf suburaxmayan elastik plyonka (şey bükmək və s. üçün işlənir). // Həmin materialdan hazırlanmış. *Sellofan kisə.*

**SELLÜLÓİD** [*lat.* sellula – hüceyrə və *yun.* eidos – növ] Tezalışan elastik-plastik kütlə (müxtəlif şeylər, oyuncaq və s. qayrılır). [Kamal] *yazı masasının dalında oturmuş, rəngli, şəffaf sellüloid parçalarından quraşdırdığı kiçik və gözəl bir təyyarə modelini qabağına qoyub ona baxırdı.* M.Rzaquluzadə.

**SÉLSİ** [*xüs. addan*] Suyun donma nöqtəsindən qaynama nöqtəsinədək 100 dərəcəyə bölünmüş termometr.

**SEL-SU** *top.* Çox güclü yağış, su, yağmur, çox güclü sel. *Bir saatda sel-su hər yeri basdı. – Eyni anda ildırım çaxıb sel-su axan çölü gündüz kimi işıqlandırdı.* İ.Əfəndiyev. [Bayram kişi:] *Sel gücü də məlumdur, odur, Mingəçevirdə bir dəsgah başlanıb ki, selin-suyun gücü ilə düz-dünyaya işıq və qüvvət verəcək.* M.Rzaquluzadə.

**SEL-SUCAQ** b a x **sel-su**. *Kəndi sel-sucaq basdı.*

**SELVA** *is.* Amazon çayı hövzəsində vaxtaşırı subasan rütubətli tropik meşələrə braziliyalıların verdiyi ad.

**SEMAFÓR** [*yun.* sema – işarə və phoros – aparıcı] *d.y.* Yolun açıq və ya bağlı olduğunu maşinistə bildirmək üçün dəmir yollarındakı işıq siqnalı qurğusu. *Semafor açıqdır. – Əjdər, Cunyatovun göstərdiyi kimi, semafora qədər ağır addımlarla getdi, semaforun yanında münasib bir yer tapıb oturdu.* S.Rəhman.

**SEMANTÍK** *sif.* Semantika (məna) ilə bağlı olan, semantika ilə əlaqədar olan. *Semantik təhlil. Sözün semantik həcmi.*

**SEMÁNTİKA** [*yun.* semanticos – anladan] *dilç.* 1. Sözün, ifadənin, qrammatik formanın mənası.

2. B a x **semasiologiya**.

**SEMASİOLÓGİYA** [*yun.* semasia – məna və logos – elm] Dilçiliyin söz və ifadələrin mənalarını və bu mənaların dəyişmələrini öyrənən bəhsi.

**SEMASİOLOJÍ** *sif.* [*yun.*] Semasiologiya ilə bağlı olan, semasiologiyaya aid olan. *Semasioloji tədqiqat.*

**SEMASİÓLOQ** [*yun.*] Semasiologiya mütəxəssisi.

**SEMÉNT** [*alm.* Zement] Tikinti işlərində istifadə edilən, su ilə qarışdırıldıqda suvaşqan kütlə halına gələn, tez bərkiyən, tozşəkilli mineral maddə. *Həyətin ortasında sement töküldü, balaca bir bağça salındı.* Mir Cəlal. *Sement kisələri balaca təpə kimi bir tərəfdə yığılmışdı.* M.Süleymanov. // Sementlə örtülmüş, sementdən hazırlanmış, sement olan.

*Sement səki. Sement divar. – Sement döşəməsinə bahalı xalça salınmış bir hücrədə, göy döşəkçə üstündə çömbəlib oturan araqçınlı molla cəld ayağa qalxıb əmmaməsini başına qoydu*. Mir Cəlal.

**SEMENTÇİ** *is.* Sement sənayesi işçisi, sement sənayesində işləyən.

**SEMENTLƏMƏ** “Sementləmək”dən *f.is.*

**SEMENTLƏMƏK** *f.* 1. Sement məhlulu tökmək, sementlə malalamaq, üzərinə sement çəkmək, sementlə örtmək. *Divarı sementləmək. Səkini sementləmək.*

2. *tex.* Sementlə bərkitmək, aralarını sementlə doldurub möhkəmləndirmək. [Xanmurad:] *Sementlədiyimiz bəndi su yuyub aparıb.* İ.Əfəndiyev. *Çox keçmədi ki, Kamil borunu basdırıb sementlədi.* M.Süleymanov. // *məc.* Möhkəmlətmək, bərkitmək. [Kələntər:] *Mənə də Kələntər deyərlər, dövrəmi elə sementləmişəm ki, heç yeri qaza bilməzlər.* M.İbrahimov.

**SEMENTLƏNMƏ** “Sementlənmək”dən *f.is. Bülənd dərənin dibində sütunların sementlənməsinə baxırdı*. Ə.Əbülhəsən.

**SEMENTLƏNMƏK** *məch.* 1. Sementlə malalanmaq, sement çəkilmək.

2. *tex.* Sementlə bərkidilmək, sementlə möhkəmləndirilmək.

3. B a x **sementləşmək** 2-ci mənada.

**SEMENTLƏŞMƏ** 1. “Sementləşmək”dən *f.is.*

2. *geol.* Süxurların tərkib hissələrinin ərimiş mineral maddələrinə yapışıb bərkiməsi prosesi.

**SEMENTLƏŞMƏK** *f.* Bərkiyib sementə dönmək, daşlaşmaq.

**SEMENTLƏYİCİ** *is. tex.* Sement çəkmək üçün, sementləməyə məxsus. *Sementləyici aqreqat.*

**SEMENTLİ** *sif.* 1. Tərkibində sement olan, sement qarışdırılmış. *Sementli beton.*

2. Sement çəkilmiş, sement qarışığı ilə malalanmış, sementlənmiş. *Sementli divar. Sementli quyu.*

**SEMÉSTR** [*lat.* semestris – yarımillik] Ali və ya xüsusi orta məktəblərdə dərs ilinin yarısı. *Semestrin ortalarında texnikumda bir mənzərə çəkmək üçün müsabiqə elan olundu.* Mir Cəlal.

**SEMİNÁR** [*lat.* seminarium – ocaq] 1. Ali məktəblərdə tələbələrin xüsusi fənn və ya mövzu üzrə keçirdikləri qrup məşğələsi. *Azərbaycan ədəbiyyatı tarixindən seminar.*

2. İxtisası, ideya-siyasi səviyyəni artırmaq üçün qruplarla keçirilən xüsusi məşğələ.

**SEMİNARÍST** [*lat.*] Seminariya tələbəsi.

**SEMİNÁRİYA** [*lat.* seminarium – ocaq] 1. Keçmişdə: orta pedaqoji məktəb. *Müəllimlər seminariyası.* – [Musanın nəvəsi] *Qori seminariyasının pansionunda bircə il yaşadıqdan sonra mədəniyyət aləmində bu qədər tərəqqi etmişdi.* Qantəmir.

2. Orta ruhani məktəbi.

**SEMİTLƏR** [Bibliya əfsanələrinə görə insan nəslinin banilərindən olan üç qardaşdan birinin – Simanın adından] Qabaq Asiyada, Şimali və Şərqi Afrikanın bir hissəsində yaşamış və yaşayan xalqlar qrupu, samilər (buraya qədim babillilər, assurilər, finikiyalılar, qədim yəhudilər və başqaları, habelə müasir xalqlardan ərəblər, suriyalılar, yəhudilər və efiopiyalılar daxildir).

**SEMİTOLÓGİYA** [semit və *yun.* logos – elm, anlayış] Semit dillərini və mədəniyyətini öyrənməklə məşğul olan elmlərin məcmusu.

**SEMİTOLOJÍ** *sif.* Semitologiyaya aid və ya mənsub. *Semitoloji tədqiqat.*

**SEMİTÓLOQ** Semitologiya mütəxəssisi.

**SEN** *is.* Yaponiyada xırda pul.

**SENÁT** [*lat.* senatus – qədim] 1. Qədim Romada yüksək hakimiyyət orqanı. *Venetsiyanın işlərini senat dolandırırdı, padşahı yoxdu. Senat isə ibarət idi alinəsəb, dövlətmənd, ağıllı və insaflı əşxasın icmaindən.* F.Köçərli.

2. İnqilabdan qabaq Rusiyada: ali məhkəmə vəzifəsini görən və dövlət aparatı üzərində nəzarəti həyata keçirən hökumət orqanı.

3. ABŞ-da konqresin baş palatası; Belçikada, Kanadada və bəzi başqa dövlətlərdə parlament.

**SENÁTOR** [*lat.*] Senat üzvü.

**SENATORLUQ** *is.* Senator vəzifəsi.

**SENSUALÍST** [*lat.*] *fəls.* Sensualizm tərəfdarı.

**SENSUALÍZM** [*lat.* sensus – duyğu] Duyğunun idrakın yeganə mənbəyi olduğunu iddia edən fəlsəfi cərəyan.

**SENT** *is.* [*ing.*] ABŞ və bəzi başqa ölkələrdə xırda pul.

**SENTESİMO** *is.* [*isp.*] Panama, Uruqvay və Çilidə xırda pul.

**SENTİMENTÁL** [*fr.*] *sif.* 1. Sentimentalizmlə əlaqədar olan, sentimentalizmlə bağlı olan. *Sentimental əsər. Sentimental mövzu.*

2. Çox tez təsirlənən, mütəəssir olan, həddindən artıq həssas olan, hissə qapılan. *Sentimental adam. Sentimental hisslər.* – [Reyhan Şahsuvarova:] *Görünür, siz o gecə çox sentimental bir əhvali-ruhiyyədəymişsiniz.* İ.Əfəndiyev.

**SENTİMENTALÍST** [*fr.*] Sentimentalizm (1-ci mənada) cərəyanı nümayəndəsi. *Sentimentalist yazıçı.*

**SENTİMENTALÍZM** [*fr.*] 1. XVIII əsrin ikinci yarısı və XIX əsrin əvvəllərində Avropada meydana gəlmiş ədəbi cərəyan (bu cərəyan nümayəndələrinin əsərlərində insan hissiyyatına daha çox üstünlük verilir, zəiflərə və məzlumlara hüsn-rəğbət göstərilir. Sentimentalizmin ən səciyyəvi xüsusiyyəti həddindən artıq həssaslıq, hissə qapılmaqdan ibarətdir). *Füzulinin dörd əsr bundan əvvəl yazdığı sentimentalist əsərlər bu gün belə bütün sentimentalizm ədəbiyyatının ilk sıralarında gedə bilər.* C.Cabbarlı.

2. B a x **sentimentallıq**.

**SENTİMENTALLIQ** *is.* Həddindən artıq nazikürəklilik, həssaslıq.

**SENTİMO** *is.* [*isp.*] Venesuela, İspaniya, Paraqvay və başqa ölkələrdə xırda pul.

**SÉNTNER** [*alm.* sentner, əsli *lat.* sentum – yüz] 100 kiloqrama bərabər metr ölçü sisteminin çəki vahidi. [Manya Fərmana:] *İstəyirəm hər hektardan yüz sentner xalis pambıq götürüm.* Ə.Sadıq. [Uğur:] *Sən elə güman edirsən ki, yüz sentnerdə dayanacağıq.* İ.Əfəndiyev.

**SENTRÍZM** [*lat.*] II İnternasional partiyalarında opportunizmin ən incə üsullarla maskalanmış forması.

**SENTYÁBR** [*lat.*] Təqvim ilinin doqquzuncu ayı.

**SENYÓR**[1] [*lat.* senior – böyük] Qərbi Avropada orta əsrlərdə: özünə məxsus olan ərazi miqyasında dövlət başçısı hüququna malik torpaq sahibi, feodal.

**SENYÓR**[2] [*isp.* senör] Ağa, cənab. [Zabit:] *Senyor, bağışlayın, buradan Qoritsiyaya neçə kilometrdir?..* S.Vəliyev.

**SENZ** *is.* [*lat.*] 1. Bir şəxsin bu və ya digər hüquqlarının həyata keçirilməsini məhdudlaşdıran şərt.

2. Bir müəssisə bu və ya digər siyahıya daxil etmək üçün lazım olan şərt.

**SÉNZOR** [*lat.*] Mətbuat üzərində nəzarəti həyata keçirən vəzifəli şəxs.

**SENZORXANA** [*lat.* sensor və *fars.* ...xanə] *köhn.* Senzuranın yerləşdiyi bina, senzor idarəsi. *Hökumətin senzorxanasına pişnihad edib bizə mühəvvəl olunan məmuriyyəti sədaqətlə yerinə yetirək.* C.Məmmədquluzadə.

**SENZORLUQ** *is.* Senzorun işi, vəzifəsi. *Və nə qədər ki onlar ölməyiblər və senzorluqda vardırlar, ruznaməyə izin ala bilsək də, bir şey yaza bilməyəcəyik.* C.Məmmədquluzadə.

**SENZÚRA** [*lat.*] 1. Mətbuata nəzarət edən dövlət idarəsi.

2. Çapa veriləcək, teatrda tamaşaya qoyulacaq əsərlərin və ya hər hansı bir materialın həmin idarə tərəfindən yoxlanması.

**SEPARATÍST** [*lat.* separatus-dan] Separatizm tərəfdarı.

**SEPARATÍZM** [*lat.* separatus – ayrılmış] Ayrılmağa çalışma. // Çoxmillətli burjua dövlətlərində: azlıqda qalan millətlərin, yaxud bir əyalətin dövlətdən ayrılaraq öz müstəqil dövlətini qurmağa çalışması.

**SEPARÁTOR** [*lat.* separator – ayıran] Bir maddəni digərindən ayırmaq üçün işlədilən müxtəlif cihazların adları. // *k.t.* Üzlü süddən qaymağı ayıran cihaz. *..Kərim dayı çardağın altında ağaran separatorlara sarı addımladı.* İ.Hüseynov.

**SEPARATORÇU** *is.* Separatorda işləyən adam.

**SEPSİS** *is.* [*yun.*] İnsan və heyvanlarda irin törədən orqanizmlərin və onların toksinlərinin qan və toxumalara düşməsindən yaranan infeksion xəstəlik.

**SEPTİK** *is.* [*ing.*] Az miqdarda məişət çirkab sularını təmizləmək üçün qurğu.

**SEPTİMA** *is.* [*lat.*] Musiqidə yeddi pərdə həcmində interval.

**SER** *is.* [*ing.*] ABŞ-da və İngiltərədə möminlərin keşişlərə, şagirdlərin müəllimlərə müraciət edərkən işlətdikləri söz; cənab.

**SERADELLA** *is.* [*ital.*] Paxlalılar fəsiləsindən bitki cinsi.

**SERB** *is.* Yuqoslaviyada yaşayan cənubi slavyan xalqının adı və bu xalqa mənsub adam.

**SERBCƏ** *sif.* və *zərf* Serb dilində. *Serbcə danışmaq. Serbcə-rusca lüğət.*

**SERENÁDA** [*ital.* serenade – axşam nəğməsi] 1. Orta əsrlərdə İtaliya və İspaniyada: adətən, sevgilinin pəncərəsi altında oxunan nəğmə.

2. İnstrumental ansambl üçün yazılmış süita tipli musiqi əsəri. *Çaykovskinin simli orkestr üçün serenadası.*

**SÉRİYA** [*lat.* series – sıra] 1. Bir-birinə eynilə oxşar və ya hər hansı ümumi əlamətə malik olan şeylər sırası. *Karandaşla çəkilmiş rəsmlər seriyası. Uşaqlar üçün yazılmış kitablar seriyası.* // Hər hansı bir işin, hərəkətin ardıcıl sırası. *Gimnastika hərəkətləri seriyası.*

2. Bir standart üzrə hazırlanan şeylər, məmulat, detallar.

3. Böyük kinofilmin bütün seans vaxtı nümayiş etdirilən müstəqil hissəsi. "*Bacılar*" *kinofilmi üç seriyadır.*

4. Qiymətli kağızların (pul, istiqraz vərəqələri və ya sənədlərin) hərf, yaxud rəqəmlə işarə olunan dərəcəsi.

**SERJÁNT** [*fr.* sergent] Orduda, polisdə kiçik komanda heyətinin rütbə adı və bu rütbəni daşıyan adam. *Polis serjantı. Kiçik serjant. – Serjant, Mədəddən gözünü çəkmədən danışırdı.* Ə.Əbülhəsən. *İndi* [Ulduz] *hərbi qiyafədə serjant rütbəsində bir şəfqət bacısı idi.* Ə.Məmmədxanlı.

**SEROLÓGİYA** [*lat.* serum – zərdab və *yun.* logos – elm, anlayış] Biologiyanın, insan və heyvanların qan zərdabı xüsusiyyətlərini öyrənən şöbəsi.

**SEROLOJÍ** *sif.* Serologiyaya aid olan. *Seroloji tədqiqat.*

**SEROZ** *is.* [*lat.*] Epitel qatı ilə örtülmüş birləşdirici toxuma.

**SERPANTÍN** [*fr.* serpent – ilan] Bal, maskarad və karnavallarda oynayanların başına, üstünə tökülən rəngbərəng, uzun kağız lentlər.

**SERTİFİKÁT** [*lat.* certum – düzdür və fasere – eləmək] 1. *mal.* Dövlətin maliyyə istiqraz iltizamnaməsi. // Bəzi dövlət istiqrazları biletinin adı.

2. Xarici ticarətdə: göndərilən malların sortu (cinsi), çeşidi, qiyməti və s. haqqında sənəd.

3. Hər hansı bir şey haqqında vəsiqə, şəhadətnamə.

**SERUM** *is.* [*lat.*] Qan zərdabı.

**SERVÁNT** [*fr.*] Qab-qacaq, süfrə, dəsmal və s. yığmaq üçün alçaq bufet.

**SERVÍZ** [*fr.*] Müəyyən miqdar şəxs üçün xörək və ya çay ləvazimatı (qabları) komplekti. *Çay servizi. Xörək servizi. Çay-qəhvə və xörək servizləri on iki və altı nəfərlik olur. – Təzə samovar, bütün servizilə, .. boşqablar, dövrələr, podnoslar, lampalar, güzgülər və bir neçə qablar .. cehiz adı ilə atası qızına verəcəkdir.* R.Əfəndiyev.

**SÉSSİYA** [*lat.* sessio – oturma] 1. Müxtəlif seçkili orqanların və kollegial idarələrin vaxtaşırı keçirilən iclasları, habelə bu iclaslar dövrü.

2. Ali və orta ixtisas məktəblərində müəyyən vaxtlarda keçilən imtahanlar, habelə həmin imtahanlar dövrü. *İmtahan sessiyası. Qış sessiyası.*

**SESSİYALARARASI** *sif.* Sessiyalar arasında olan, sessiyalar arasında görülən, aparılan.

**SEŞƏNBƏ** *is.* [*fars.*] Köhnə təqvimdə: həftənin dördüncü günü, təzə təqvimdə: çərşənbə axşamı; salı, tək gün.

**SET** *is.* [*ing.*] Voleybolda, tennisdə oyunun hissələri.

**SETAR** *is.* [*fars.*] Şərq simli musiqi alətlərindən birinin adı; tarın bir növü. [Ərən:] *İçəri, əlində setar, gözəl bir qız girdi.* Çəmənzəminli.

**SEVDA** *is.* [*ər.*] 1. Sevgi, məhəbbət, eşq. *Eşq sevdasına heç kəs pis deməz; Məhəbbət yolundan ayaq kəs, deməz.* M.P.Vaqif. [Qəndab:] *Sonra mənə məlum oldu ki, Çingizlə* [Qönçənin] *sevdası elə o vaxt baş tutmayıb.* B.Bayramov. ☐ **Sevdaya düşmək** – sevmək,

məhəbbət yetirmək, eşqə düşmək, vurulmaq, məftun olmaq. *Bir Leyli sevib eşqdə sevdalərə düşdüm; Məcnuna dönüb damәni-səhralərə düşdüm.* S.Ə.Şirvani.

2. Arzu, həvəs, şiddətli meyil. *Mənə hökm eyləmişdi bir xülya; Atəşin şövq, odlu bir sevda*. A.Səhhət. [Sitarə:] *Yenə düşdü xəyalıma Vətən sevdası, ya rəbbi!* C.Cabbarlı. *Xəzan acısına edib məhəmmül; Gülün kölgəsində ötəndə bülbül; – Həyat, həyat! – deyə çırpınır könül; Könüldən, sevdadan necə əl çəkim?* M.Müşfiq. ☐ ...**sevdasına düşmək** – ...arzusunda olmaq, ...həvəsinə düşmək, can atmaq. *Dul qalmasını görüncə, Məşədi övlad məsələsini ortaya salıb, Gülcahan xanımı almaq sevdasına düşmüşdü.* T.Ş.Simurq. *Nəcibə onilliyi qurtarandan sonra ali məktəb sevdasına düşdü.* Mir Cəlal.

**SEVDALI** *sif.* Sevdaya düşmüş, məftun olmuş; məftun, vurğun, aşiq. *Çəmən döşəyidir sevdalı yarın; Ona layla deyir səhər küləyi.* S.Vurğun. *Ətirlənir güllərin; Sevdalı bülbüllərin; Ötüşür can bağımda*. M.Müşfiq. [Rza:] *Gülər üzləri çoxdan kədər, aydın baxışları duman, sevdalı könülləri nifrət bürümüşdü.* M.İbrahimov.

**SEVDİCİK** *oxş.* Adətən "sevdiciyim" şəklində – çox istənilən, əzizlənən adama müraciət tərzində işlənir. *Lay-lay mələkim, sevdiciyim, yavrucuğum, yat! Bir də ələ düşməz bu çocuqluq dəmi, heyhat!* A.Şaiq. *Oxu sevdiciyim, öz həvəsinlə! İlham qanadlanır sənin səsinlə!* M.Müşfiq.

**SEVDİRMƏ** "Sevdirmək"dən *f.is.*

**SEVDİRMƏK** *icb.* Sevməyə məcbur etmək, istətmək; nə yolla olur olsun bir şeyi başqasına istətməyə, bəyəndirməyə çalışmaq, birinin istəyini qazanmağa çalışmaq. *Bir qadın gözəlliyi, mərifəti və özünü sevdirməyi bacarırsa, ona bağlanmaq mümkündür.* M.S.Ordubadi. *Gülü də sevdirən bizə ətirdi; Gəl hikmət axtaraq söz gülzarında.* B.Vahabzadə.

**SEVƏR** Adətən "yerindən" sözü ilə: zəif, incə, çox qorxulu, xətərli. [Pəri ovçuya:] *İndi əgər sən onu sevər yerindən yaralamısansa, mən də sağ qalmayacağam, laçınım.* Ə.Məmmədxanlı. [Süleyman:] *Güllə sevər yerindən dəyib, haman saat yıxılmasaydı, bunun xəncər dişlərindən qurtara bilməzdiniz.* M.Rzaquluzadə.

**...sevər** *sif.* Mürəkkəb sözlərin "istəyən", "sevən", "tərəfdar olan" mənasında işlənən ikinci tərkib hissəsi; məs.: azadlıqsevər, sülhsevər, insansevər, kitabsevər.

**SEVƏ-SEVƏ** *zərf* Sevərək, istəyərək, məhəbbətlə. *Füzulini sevə-sevə oxumaq. – Onu dinləmişəm mən sevə-sevə; Gül açıb hər sözü dodaqlarımda.* S.Rüstəm. "*Aldanmış kəvakib*" *xalqımızın hər zaman sevə-sevə oxuduğu qüvvətli bir satiradır.* S.Rəhman.

**SEVGİ** *is.* 1. Məhəbbət, eşq. *Sevgim mübarizə, sevgilim həyat; Yəhərlənmiş bana qanadlı bir at.* M.Müşfiq. *Sevgi əzəl gündən sevir baharı; Baharda insanlar arzuya çatır.* N.Xəzri.

2. *klas*. Sevgili. *Bir belə cavanın əqli kəm olsa; Baxırsan ki, sevgisinə naz eylər.* M.P.Vaqif. *Adətdir ki, olur xubruların; Sevgisinin yadigarı yanında*. Q.Zakir.

**SEVGİLİ** *sif.* Çox sevilən, əzizlənən, istənilən; əziz, mehriban. *Sevgili uşaqlar. Sevgili dost. – Könlümün sevgili məhbubu mənim; Vətənimdir, Vətənimdir, Vətənim!* A.Səhhət. // İs. mənasında. [Gülçöhrə:] *Mən öz sevgilimi istəyirəm*. Ü.Hacıbəyov. [Səriyyə Rüstəmə:] *Nə üçün öz sevgilini zalımlar əlində qoyub xilas etmirsən?* C.Cabbarlı.

**SEVGİSİZ** *zərf* və *sif.* Sevgi hissi olmadan, sevmədən, məhəbbətsiz, istəmədən. *Sevgisiz ərə getmək*. – [Aşıq Sultan:] *Vicdanları parlaq tutan sevgidir; Sevgisiz könül ya daşdır, ya dəmir.* H.Cavid. *Sevgisiz, yoldaşsız bir gözəl kimi; Sükuta qərq olub yaşardın əlbət.* M.Dilbazi.

**SEVİB-SEÇMƏ** "Sevib-seçmək"dən *f.is.*

**SEVİB-SEÇMƏK** *f.* İstəyərək, xoşlayaraq, bəyənərək bir neçə adamın, şeyin arasından birini ayırmaq, seçmək. *Sevib-seçdiyi qız. Sevib-seçdiyi sənət*. – [Bibixanım Göyçəyə:] *..Kimi sevib-seçsə, ürəyinə kim yatsa, ona da getsin.* B.Bayramov. [Qoşqar:] *Mən neçə dəfə təklif elədim ki,* [kolxoza] *Rəhimlini yox, camaatın özünün sevib-seçdiyi bir adam göndərək.* İ.Hüseynov.

**SEVİCİ** *is.* və *sif.* Sevən, vurğun, aşiq. [Oqtay:] *Nəhayət, mən* [Firəngizə] *anladaram ki, mənim heç bir şeyim yoxsa, pak bir*

*eşqim, sevici bir ürəyim* .. [var]. C.Cabbarlı. *Bu gözəl və gənc gadın* [Yaxşı] *nəcib duyğulara, sevici bir qəlbə, şairanə bir hissiyyata malikdir*. M.Arif.

**SEVİLMƏ** "Sevilmək"dən *f.is.*

**SEVİLMƏK** "Sevmək"dən *məch. Mən bəxtiyar oldum, o zamandan ki sevildim.* B.Vahabzadə.

**SEVİMLİ** *sif.* 1. Mehriban, əziz, sevgili, istəkli. [İncə:] ..*Uşaq könlüm heç fərqinə varmadı. O hər kəsdən dəyərli, igid, gözəl, sevimli...* C.Cabbarlı. [Xaqani:] *Oxu, bülbülciyim, səsinə qurban; Ey ilham pərisi, sevimli canan!* M.Rahim.

2. Xoşagələn, xoşlanılan, insanın məhəbbətini cəlb edən; cazibəli. *Sevimli səs. Sevimli nəğmə. – Onun ən gözəl və sevimli xüsusiyyətlərindən birisi zahiri görünüşündə olan məhcubluğu, həyalılığı və utancaqlığı idi.* M.S.Ordubadi. *Bura mənim sevimli yerlərimdən biri idi*. A.Divanbəyoğlu.

**SEVİMSİZ** *sif.* Sevilməyən, xoşa gəlməyən; cazibəsiz. *Sevimsiz bir sima*.

**SEVİNC** *is.* Fərəh, şadlıq; sevinmə (*kədər* əksi). *Hər şeydə fərəh, sevinc, təravət; Artıq oyanıb gülür təbiət.* A.Şaiq.

**SEVİNCƏK** *zərf* Sevinə-sevinə, sevinərək, çox şad, fərəh içərisində. *Sevincək daxil olmaq. Sevincək getmək. – Hamı sevincək ayağa qalxır.* Ü.Hacıbəyov. *Lətiflə Həsən .. sevincək əl-ələ verdilər və sağ tərəfdəki mərmər pilləkənlərlə yuxarı, ikinci mərtəbəyə qalxdılar.* H.Seyidbəyli.

**SEVİNCLİ** *sif.* və *zərf* Sevinc içərisində, fərəhli, şad. [Student] *sevincli bir halda qulluqçunu çağırdı, xanımın yanına kitab dalınca göndərdi.* Çəmənzəminli. [Laçın] *sonra isə baxıb sevincli bir hal ilə gülümsəməyə başladı.* H.Nəzərli. [Quşlar] *dəstə-dəstə uçub gəldilər, sevincli çığırtılarla Afaqın bağçası üstündə qanad çalıb dövrə vurdular.* Ə.Məmmədxanlı. // Sevinc verən, sevindirən, fərəhli.

**SEVİNCSİZ** *sif.* Fərəhsiz, pərişan, məyusedici, qəmləndirici, kədərləndirici. *Sevincsiz mənzərə.*

**SEVİNDİRİCİ** *sif.* Sevinc gətirən, fərəh oyadan, şad edən; fərəhləndirici, sevindirən, ürəkaçan, xoş. *Sevindirici hal. Sevindirici xəbər.* – [Məktəb müdiri] *ayağa qalxıb şagirdlərə son dərəcə ciddi, həm də sevindirici bir xəbər verdi.* H.Seyidbəyli.

**SEVİNDİRMƏ** "Sevindirmək"dən *f.is.*

**SEVİNDİRMƏK** *f.* Sevinməsinə səbəb olmaq, şad etmək, fərəhləndirmək, şadlandırmaq. *Şad xəbər hamını sevindirdi. – Tahirin bu cür düşüncəli və ciddi bir əda ilə danışmağı Lətifəni sevindirdi.* M.Hüseyn. *Bilirəm, ən xoşbəxt, gözəl günlərim; Bu evdə hamını sevindirəcək*. Ə.Kürçaylı.

**SEVİNƏ-SEVİNƏ** *zərf* Şad, çox razı halda, sevinərək, sevinc içində. *Sevinə-sevinə getmək. Sevinə-sevinə oxumaq. – Əhməd evdən ildırım kimi həyətə qaçıb, sevinə-sevinə və ləhləyə-ləhləyə gəldi anasının yanına*. C.Məmmədquluzadə. *Kəndlilər ağanın dağıdılmış evinə baxıb, dərindən nəfəs aldılar, sonra isə sevinə-sevinə evlərinə getdilər*. S.Rəhman.

**SEVİNİŞMƏ** "Sevinişmək"dən *f.is.*

**SEVİNİŞMƏK** *qarş*. Hamı birlikdə sevinmək, şadlanmaq, fərəhlənmək. *Şad xəbərdən hamı sevinişdi.* – [Qızlar] *sevinişdilər, nəhayət, atlar uzaqdan göründü*. M.S.Ordubadi.

**SEVİNMƏ** "Sevinmək"dən *f.is.*

**SEVİNMƏK** *f.* Xoş xəbərdən, hadisə və ya işdən fərəh duymaq, şadlanmaq, vəcdə gəlmək. *Şairin sevinci evlə bir oldu. Anası da həm sevinir, həm nisgillənirdi*. Çəmənzəminli. *Əziz mehribanım, çatdı məktubun; Nə qədər sevindik, bilsən, ürəkdən*. M.Rahim.

**SEVİŞMƏ** 1. "Sevişmək"dən *f.is.*

2. Sevgi, məhəbbət, eşq.

**SEVİŞMƏK** *qarş*. Bir-birini sevmək, bir-birinə eşq yetirmək. *Gülbənd ilə kiçik əmioğlumun sevişdiklərini bilirdim.* S.S.Axundov. [Teymur] *hələ on yeddi yaşında ikən özüylə birlikdə oxuyan Şogik adlı bir qızla sevişirdi*. M.Hüseyn.

**SEVMƏ** "Sevmək"dən *f.is. İnsanın insanı sevməsi, bir-birinə məhəbbət bağlaması təbiidir.* N.Nərimanov.

**SEVMƏK** *f.* 1. Eşq yetirmək, aşiq olmaq. *Səni sevən çox bəlaya tuş olur; Əql gedir başdan, fəramuş olur*. M.P.Vaqif. [Əsgər:] *Əlbəttə, xanım. Göz gördü, könül sevdi.* Ü.Hacıbəyov. *Əşrəf Nazlını ilk görən gün sevdi*. S.Rəhman. // Qəlbən bağlı olmaq, sadiq olmaq. *Vətənini sevmək. Ailəsini sevmək.*

– [Nizami:] *Mən bu yerləri sevirəm. Sevgi isə mənim ən böyük ilham mənbəyimdir.* M.Hüseyn.

2. Əzizləmək, oxşamaq, riqqət göstərmək. *Həqiqət ər və arvad Bahadıra nəinki bir eyib tapmırdılar, hətta onu sevirdilər*. N.Nərimanov. *Aslan gah əmir, gah da döşdən ayrılıb hıçqırırdı. Onun belə kövrəldiyini görən Gilə arvad nəvəsini qucağına alıb, sevməyə, oxşamağa başladı*. Ə.Vəliyev.

3. Bir şeyin aludəsi olmaq, ona hədsiz maraq göstərmək, meyli olmaq, çox istəmək, xoşlamaq. *Mütaliəni sevmək. Əl işlərini sevmək*. – [Firidun Sərhəngə:] *Sərhəng, mən sizin haqqınızda çox şey eşitmişdim, lakin şuxluğu sevən* (f.is.) *adam olduğunuzu eşitməmişdim.* M.İbrahimov. *Yer üzündə sevdiyim; Çiçəklərdir, çiçəklər*. N.Xəzri.

◊ **Allahı sevərsən** – bax **Allah**. *Gəl, Allahı sevərsən, zahida, sən bu riyadan keç*. S.Ə.Şirvani. [Hacı Osman:] *Rəhim bəy, bir bəri gəl! Allahı sevərsən, bu xatanı mənim başımdan elə..* Ə.Haqverdiyev.

**SEYF** [*ing.* safe – təhlükəsiz, etibarlı] Qiymətli kağızları, sənədləri, pul və s. saxlamaq üçün yanmayan metaldan qayrılmış şkaf və ya yeşik. *Kapitan .. seyfi açıb oradan bir qovluq çıxartdı.* Ə.Əbülhəsən. *Katib birdən nəyisə xatırlayıb seyfə yaxınlaşdı*. B.Bayramov.

**SEYİD** *is.* [*ər.*] *din.* 1. Məhəmməd peyğəmbərin nəslindən olan müsəlmanların fəxri titulu. *Hər vilayətdə var beş-on qəsəbə; Əlli min seyyidü axund, tələbə*. S.Ə.Şirvani. [Məsmə:] *Anam, dayılarım məni* [kor kişiyə] *verdilər. Çünki onlar kənddə nüfuzlu, kəramət sahibi seyidlər hesab olunurdular.* S.Hüseyn.

2. Ləqəb kimi seyidlərin adlarından əvvəl deyilir. *Bir əlli-altmış il bundan əqdəm iki nəfər kukəmərli seyid – biri Seyid Əhməd və biri Seyid Səməd Qafqaza varid olurlar*. Ə.Haqverdiyev.

**SEYİDMALI** *din*. bax **xüms**. [Seyidlər] *cavab verdi ki, əlbət, sizdən seyidmalı xahiş edəcəklər*. C.Məmmədquluzadə.

**SEYİZ** *is.* Sürünün qabağında gedən təkə.

**SEYM** *is.* [*pol.*] Bəzi ölkələrdə qanunverici orqan, parlament, məclis.

**SEYR[1]** *is.* [*ər.*] Əylənmək və istirahət məqsədilə gəzinti, ayaqseyri, gəzmə, gəzinmə. ☐ **Seyr etmək** – gəzmək, gəzintiyə, ayaqseyrinə çıxmaq. *Çıxıb başmaqseyrinə, edib seyri-çəmən gəldim; Ayaq üstdən Qazağa bir gedib, gördüm vətən, gəldim.* M.P.Vaqif. **Seyrə çıxmaq** – gəzintiyə çıxmaq, gəzməyə çıxmaq; gəzmək, gəzinmək; çəmənlikdə, bağda və s.-də əylənmək. *Əğyar ilən çıxıb seyrə, dərməsin; Layiq olmaz anlamaza bənövşə*. M.P.Vaqif. *Yarpaqlanır ağaclar; Yaşıllanır yamaclar; Seyrə çıxır uşaqlar; Göy çəməndə oynaqlar*. A.Səhhət.

**SEYR[2]** *is.* [*ər.*] Seyr etmə, baxma, tamaşa etmə, göz gəzdirmə. [Vaqif] *meşənin seyrindən ayrılıb Mədinəni süzməyə başladı.* Çəmənzəminli. ☐ **Seyr etmək** – baxmaq, tamaşa etmək. *Ətrafı seyr etmək. – Xanların sözünə baxmayaraq qapının aralığında durub yağışı seyr edirdim.* Qantəmir. *Seyr edib yaxını, gah da uzağı; Bir az seçə bildim qaranı ağdan.* B.Vahabzadə. **Seyrə dalmaq** – fikri bir şeyin seyrinə getmək, seyr etmək. [Arxeoloq:] *Bu bəzəkli çöllərin; Seyrinə dalan zaman; Coşmamış olmaz ürək.* H.Hüseynzadə.

**SEYRAN** [*ər.* seyr və *fars.* ...an] 1. Bax **seyr[1]**. ☐ **Seyrana çıxmaq** – seyrə çıxmaq. *Ay gecə qəbrində cövlana çıxsın; Ulduzlar süzülüb seyrana çıxsın.* M.Müşfiq. *Çıxmış dəniz sahilinə iki gənc qız seyrana; Xeyli gəzib dolaşırlar... Sonra isə yan-yana; Sahildəcə oturaraq başlayırlar söhbətə*. N.Xəzri.

2. Bax **seyrəngah**. *Xoş gün bayramın olsun; Gülşən seyranın olsun! Niyə gec-gec gəlirsən? Canım qurbanın olsun!* (Bayatı).

**SEYRÇİ** *is.* 1. Seyrə, gəzməyə çıxan adam. *Seyrçilər kəndə girərkən küçələrin tünlüyü daha da artmış oldu*. Ə.Əbülhəsən.

2. *məc.* Uzaqdan baxaraq işə qarışmayan, müşahidə etməklə kifayətlənən, müşahidəçi; bir hadisəyə, işə passiv, laqeyd münasibət göstərən adam. *Hadisəyə bir seyrçi kimi baxmaq.* ☐ **Seyrçi qalmaq** – bir hadisə qarşısında heç bir maraq və əlaqə göstərməyərək, ona bir tamaşaçı kimi baxmaq, işə qarışmamaq. *İşə seyrçi kimi qalmaq olmaz*.

**SEYRƏK** *sif.* 1. Bir-birindən aralı, uzaq, sıx, qalın olmayan, adda-budda (*sıx* əksi). *Seyrək meşə. Seyrək ot. – Uzaqda görünən*

*seyrək pöhrəliyin içi və dilik-dilik olan yalların sinəsi yarılırdı*. S.Rəhimov. // Eyni mənada saç, tük haqqında. *Gözlərinin mehriban gülüşü yadımdadır; Saçlarının seyrək gümüşü yadımdadır*. R.Rza. [Xoşqədəm nənənin] *çallaşmış seyrək qaşları altdan işıldayan, çuxura düşmüş, xırda, qara gözləri hələ öz nurunu itirməmişdi*. S.Qədirzadə.

2. Bütöv halında olmayan, parça-parça, ara-sıra. *Ay saf göydə öz gediş sürətini artırmış, ağ pambıq kimi seyrək buludlar onu gəlin aparan kimi əhatə etmişdir*. H.Nəzərli. *Ağ seyrək dumanı aparır külək; Üzür bir oğlanla bir qız qayıqda.* H.Hüseynzadə.

3. *Zərf mənasında*. Ara-sıra, hərdənbir, az-az, tək-tək. *Seyrək eşitdiyin hər söhbətində; Ölüm düşünərdi, ölmək arardı.* S.Vurğun. *Seyrək keçir hələ atlı, piyada; Bəzəkli faytonlar yoxdur orada*. H.K.Sanılı.

◊ **Ağıldan seyrək** – b a x **ağıldan kasıb** ("**ağıl**[1]"da).

**seyrək-seyrək** *zərf* Arabir, bəzən, hərdənbir, ara-sıra. *Seyrək-seyrək atılan güllələr uzaqlaşaraq qeyb oldu*. Ə.Vəliyev. *Yavaş-yavaş yelləncək havadan düşür, bayaqkı kimi yuxarı qalxmayaraq seyrək-seyrək yellənirdi*. Ə.Əbülhəsən.

**SEYRƏKBIĞ(LI)** *sif.* Bığı seyrək olan, qalın olmayan. *Seyrəkbığlı kişi.*

**SEYRƏKÇƏTİRLİLƏR** *is. bot.* Çətirləri sıx olmayan, seyrək olan bitkilər fəsiləsi.

**SEYRƏKDİŞ(Lİ)** *sif.* Dişləri seyrək, aralı olan. *Seyrəkdişli uşaq.*

**SEYRƏKLƏMƏ**[1] "Seyrəkləmək[1]"dən *f.is.*

**SEYRƏKLƏMƏ**[2] "Seyrəkləmək[2]"dən *f.is.*

**SEYRƏKLƏMƏK**[1] *f.* Seyrək etmək, bir-birindən aralamaq, ara qoymaq, seyrək hala gətirmək. *Bağı seyrəkləmək. Pambığı seyrəkləmək.*

**SEYRƏKLƏMƏK**[2] *f.* Səfehləmək, ağlını azdırmaq, gicləşmək, axmaqlamaq. [Diyar kişi:] *Nə seyrəkləyirsən, ay arvad!* Ə.Məmmədxanlı.

**SEYRƏKLƏNDİRMƏ** "Seyrəkləndirmək"dən *f.is.*

**SEYRƏKLƏNDİRMƏK** *f.* Seyrək hala gətirmək, seyrək etmək. *Tingləri seyrəkləndirmək.*

**SEYRƏKLƏNMƏ** "Seyrəklənmək"dən *f.is.*

**SEYRƏKLƏNMƏK** 1. *məch.* Seyrək hala gətirilmək, seyrəldilmək. *Bağda ağaclar seyrəklənmişdir.*

2. *məc.* Azalmaq. *İdarəyə gələnə qədər Qorxmazın üzünü çulğamış qalın kədər dumanı indi parçalanmış, seyrəklənmiş və get-gedə çəkilib gedirdi*. Ə.Vəliyev.

3. Bir-birindən aralanmaq, uzaqlaşmaq; dağılışmaq. *Atlılar seyrəklənərək iki sıra olub, təpələrin arası ilə gedən ensiz cığıra buruldular*. Ə.Vəliyev.

**SEYRƏKLƏŞDİRİLMƏ** "Seyrəkləşdirilmək"dən *f.is.*

**SEYRƏKLƏŞDİRİLMƏK** *məch.* Seyrək hala gətirilmək, bir-birindən aralı etmək.

**SEYRƏKLƏŞDİRMƏ** "Seyrəkləşdirmək"dən *f.is.*

**SEYRƏKLƏŞDİRMƏK** b a x **seyrəltmək**. *Meynələri seyrəkləşdirmək.*

**SEYRƏKLƏŞMƏ** "Seyrəkləşmək"dən *f.is.*

**SEYRƏKLƏŞMƏK** *f.* 1. Seyrək hala gəlmək, bir-birindən aralı olmaq; sıxlığı, qalınlığı azalmaq. *Kollar getdikcə seyrəkləşirdi.* – *..Yaz buludları sanki tankın gurultusundan qorxub seyrəkləşir, hürkür, qaçışırdı*. M.Hüseyn. // Getdikcə seyrək olmaq, sıxlığı, qalınlığı azalmaq. *Qadir Zeynalın qışqırığını qalın meşəliyin çox seyrəkləşdiyi sarı qaya başlanğıcına yetişərkən eşitdi.* Ə.Əbülhəsən.

2. Azalmaq, ara-sıra olmaq, az-az nəzərə çarpmaq. *Gəlib-gedən seyrəkləşdi.* S.Rəhimov.

**SEYRƏKLƏTDİRMƏ** "Seyrəklətdirmək"dən *f.is.*

**SEYRƏKLƏTDİRMƏK** *icb.* Seyrək hala saldırmaq, bir-birindən aralatdırmaq. *Ağacları seyrəklətdirmək.*

**SEYRƏKLƏTMƏ** "Seyrəklətmək"dən *f.is.*

**SEYRƏKLƏTMƏK** b a x **seyrəklətdirmək**.

**SEYRƏKLİK** *is.* Seyrək şeyin halı, azlıq (*qalınlıq, sıxlıq* ziddi). *Saçın seyrəkliyi. Meşənin seyrəkliyi.*

**SEYRƏKSAÇ(LI)** *sif.* Saçı seyrək olan, saçı qalın (sıx) olmayan. *Seyrəksaç qız.* – *Orta yaşlarında, arğaz, seyrəksaç dəllək Leylək Ələmdarın heybətli sifətini görüncə hırıldaya-hırıldaya* [dedi].. S.Rəhimov.

**SEYRƏKSAQQAL(LI)** *sif.* Saqqalı seyrək olan, saqqalı qalın (sıx) olmayan. *Seyrəksaqqal kişi*. – [Nəbi Həcərə:] *Bəs seyrəksaqqal Sarımsaqoğlunu unutmusanmı?* S.Rəhimov.

**SEYRƏKTÜKLÜ** *sif.* Tükü seyrək olan, tükü sıx (qalın) olmayan.

**SEYRƏKYARPAQ(LI)** *sif.* Yarpaqları seyrək, aralı olan; az olan, sıx (qalın) olmayan. *Seyrəkyarpaqlı ağaclar. Seyrəkyarpaq kol.*

**SEYRƏKYUN(LU)** *sif.* Yunu seyrək olan, yunu sıx (qalın) olmayan. *Seyrəkyunlu qoyun.*

**SEYRƏLDİLMƏ** "Seyrəldilmək"dən *f.is. Pambıq əkininin seyrəldilməsi*.

**SEYRƏLDİLMƏK** bax **seyrəkləndirmək**.

**SEYRƏLMƏ** "Seyrəlmək"dən *f.is.*

**SEYRƏLMƏK** *f.* 1. Seyrək hala gəlmək, azalmaq, tökülmək (saç, qaş və s. haqqında). [Bəhlul:] *Seyrəlmiş* (f.sif.) *tüklər* [atamın] *uzunsov başına yalanmış kimi yatmışdı*. B.Bayramov.

2. Parçalanmaq, dağılmaq, seyrəkləşmək. *Torpaq qızır..., qar əriyir..., çaylar bulanır...; Gah seyrəlir, gah sıxlaşır əlvan buludlar*. S.Vurğun. *Yavaş və yeknəsəq piyada addımlarının səsi altında qaranlıq seyrəlir, üfüq işıqlanırdı*. Mir Cəlal.

3. Ara-sıra olmaq, hərdənbir olmaq, tək-tək görsənmək. *Gələn-gedən seyrəlmişdi*. – [Qəhrəman:] *..minlərlə atılan yaylım atəşləri bir az seyrəldi, topların səsi lap kəsildi*. H.Nəzərli. *Küçələrdə izdiham seyrəlmişdi*. Ə.Məmmədxanlı.

**SEYRƏLTMƏ** "Seyrəltmək"dən *f.is. Bitkinin seyrəltmə dövrü. – Gülşən seyrəltmə işlərilə eyni zamanda alaq vurmalarını manqa üzvlərinə məsləhət gördü.* Ə.Vəliyev.

**SEYRƏLTMƏK** bax **seyrəkləşdirmək**. *Sərvinaz .. kösövləri qazanın altından çəkib közü seyrəltdikdən sonra başını qaldırdı.* B.Bayramov.

**SEYRƏNGAH** *is.* [*ər.* seyr və *fars.* ...gah] Seyr yeri, gəzinti üçün səfalı, mənzərəli yer. *Kür qırağının əcəb seyrəngahı var; Yaşılbaş sonası, hayıf ki, yoxdur!* M.P.Vaqif. *Yayda yaylağımdır, qışda oylağım; Yazda seyrəngahım bu dağlar mənim!* Aşıq Ələsgər. – *Bəli, tanıyıram, – dağ gəldi dilə; – Qocaman Qafqazın seyrəngahını.* N.Xəzri.

**SEYSMÍK** *sif.* [*yun.* seismoz – zəlzələ] Zəlzələ ilə əlaqədar olan, zəlzələyə aid olan. *Seysmik hadisə. Seysmik dalğa*. // Zəlzələyə məruz, zəlzələ ola bilən. *Seysmik sahə. – Seysmoloq .. şəhərin seysmik cəhətlərini telefonla .. bir daha aydınlaşdırdıqdan sonra təkidlə dedi...* B.Bayramov. // Yer qabığında baş verən titrəyişlərin qeydə alınması ilə bağlı olan. *Seysmik xəritə. Seysmik cihaz. – Şeyda əsasını qoymağa çalışdığı seysmik stansiyanın layihəsini özü işləmişdi.* B.Bayramov.

**SEYSMÓQRAF** [*yun.* seismos və grapho – yazıram] Yer qabığının titrəyişini avtomatik qeydə alan cihaz.

**SEYSMOQRÁFİYA** [*yun.*] 1. Yer qabığındakı titrəyişin seysmoqraf vasitəsilə qeydə alınması.

2. Bax **seysmologiya**.

**SEYSMOQRÁM** [*yun.* seismos – zəlzələ və gramma – yazma] Yer qabığının titrəyişinin seysmoqraf vasitəsilə avtomatik surətdə yazılması.

**SEYSMOLÓGİYA** [*yun.*] Geologiyanın, Yer qabığının titrəyişindən bəhs edən şöbəsi.

**SEYTNÓT** *is.* [*alm.*] Şahmat və dama oyunlarında fikirləşmək üçün müəyyən olunmuş vaxtın darlığı.

**SEYVAN** bax **eyvan**.

◊ **Qulaq seyvanı** *anat.* – qulağın xarici hissəsi.

**SEZARİZM** *is.* [*lat.*] Dövlət hakimiyyəti başında hakimiyyəti zorla qəsb etmiş şəxsin durduğu siyasi üsul; idarə.

**SEZDİRMƏ** "Sezdirmək"dən *f.is.*

**SEZDİRMƏK** *f.* Hiss etdirmək, dolayı yolla anlatmaq, bildirmək, büruzə vermək. *Məşədibəy göz vura-vura anasının bərk incidiyini ona sezdirmək istəyirdi.* M.Hüseyn.

**SEZİLMƏ** "Sezilmək"dən *f.is.*

**SEZİLMƏK** *f.* Duyulmaq, hiss edilmək, başa düşülmək. *Üzüntülü bir intizar* [Rübabənin] *hərəkətlərindən sezilirdi*. Mir Cəlal. *Nabat xala güclə sezilən* (f.sif.) *bir təbəssümlə soruşdu*. İ.Əfəndiyev.

**SEZMƏ** "Sezmək"dən *f.is.*

**SEZMƏK** *f.* Duymaq, hiss etmək, başa düşmək, anlamaq. *Şadlığını üzündən sezmək.*

*– Çinarlıqda yalnız başıma gəzdim; Bu halda incə bir inilti sezdim.* H.Cavid. *Vaqif bütün incəliklərinə qədər bələd olduğu bu çöhrədəki dəyişikliyi sezdi.* Çəmənzəminli. *Əsarətdə yaşayan insanların ahını; Baxışlarda sezmişəm, ürəklərdə görmüşəm*. M.Rahim.

**SƏADƏT** *is.* [*ər.*] 1. Həyatda ən yüksək məmnunluq hissi; bir şəxsin hər hansı bir şeydən duyduğu dərin məmnunluq və sevinc hissi; xoşbəxtlik. [Murad] *özünün səadət və istirahətini yalnız Nigarla bərabər yaşamaqda görürdü.* S.Hüseyn. *Şair anam Azərbaycan, sən vüqarımsan; Nəğməmsən, şerimsən, şeriyyətimsən; Sən mənim dünənki yaralarımsan; Sən mənim bugünkü səadətimsən!* Ə.Kürçaylı. *Mən də, bu gözəl yaz gecəsi də həyəcan və səadət içindəydik.* İ.Əfəndiyev.

2. *məc.* Obrazlı təşbehlərdə, məs.: səadət yolu, səadət qapıları, səadət məşəli, səadət nuru və s. – [Zəhra:] *Ədalət dünyada əlvan gül açsın; Səadət günəşi nurunu saçsın*. M.Rahim. *Səadət qapıları* [Zərqələmin] *üzünə açılırdı*. Ə.Sadıq.

**SƏADƏTLİ** *sif.* Xoşbəxt, bəxtiyar, məsud, uğurlu. *Səadətli günlər. Səadətli gələcək. – Hər quşun olmaz səadətli hümatək kölgəsi*. Nəsimi. [Fəxrəddin:] *Mənim ağam, nə üçün də utansınlar, bir halda ki, bunlar üçün səadətli və rahat gələcək düzəltməyə çalışırlar..* M.S.Ordubadi.

**SƏADƏTSİZ** *sif.* Bəxtsiz, bədbəxt, uğursuz. *Sözün şənində şöhrət var, bu məna qəflətən solmaz; Çiçəksiz, sözsüz, insansız, səadətsiz bahar olmaz!* S.Vurğun.

**SƏADƏTSİZLİK** *is.* Bəxtsizlik, bədbəxtlik, uğursuzluq.

**SƏBA, SƏBA YELİ** *is.* [*ər.*] *şair*. Səhər əsən xəfif yel; meh. *Səba, əhvalımı bir-bir; Varıb ol yarə ərz eylə*. M.V.Vidadi. *Səba, məndən söylə ol gülüzarə; Bülbül gülüstana gəlsin, gəlməsin?* Ə.Nəbati. [Şair:] *Gəl, gəl, geniş-geniş açım qolumu; Səni, səba yeli, basım bağrıma.* N.Xəzri.

**SƏBAT** *is.* [*ər.*] Axıra qədər sözünün üstündə durma, iqrarında möhkəm olma; dəyanət, sabitlik, davamlılıq, möhkəmlik, mətanət, əzm. *Bizimdir yüksəliş, bizimdir qanad; Bizimdir mətanət, bizimdir səbat*. M.Müşfiq.

**SƏBATLA** *zərf* Mətanətlə, dözümlə, möhkəmliklə, səbat göstərərək.

**SƏBATLI** *sif.* Sözünün üstündə duran, iqrarında möhkəm olan; dəyanətli, mətanətli, möhkəm, əzmli. *Səbatlı tələbə*. – [Məsmədə] *..əzmkar, səbatlı bir adamın hal və hərəkəti vardı və yaxud mənə elə təsir bağışlayırdı*. S.Hüseyn.

**SƏBATSIZ** *sif.* Sözünün, qərarının üstündə durmayan, sabit olmayan, möhkəm olmayan, mətanət göstərməyən; mütərəddid, dəyanətsiz. *Səbatsız adam.*

**SƏBATSIZLIQ** *is.* Sözünün, qərarının üstündə durmama; dəyanətsizlik, qərarsızlıq.

**SƏBƏB** *is.* [*ər.*] 1. Bir şeyin, hadisənin baş verməsini şərtləndirən başqa hadisə, şərait. *Nöqsanların səbəbi. İşə gəlməməyinizin səbəbi nədir? Hər şeyin səbəbi var.*

2. Bais, baiskar, səbəbkar, təqsirkar. [Yaralı:] *Səbəbin evi dağılsın. Gəldilər, camaatı başdan çıxartdılar*. Ə.Haqverdiyev. *Səriyyə xalanın Qərənfilə müştəri gözü ilə baxmasının əsas səbəbi Bahadur idi*. S.Rəhman. ☐ **Səbəb olmaq** – bais olmaq. *Nə sən fəraqə səbəb olmusan, nə mən bais; Bu dərdə saldı bizi dövri-ruzigar, ey dust!* S.Ə.Şirvani. *Bu faciənin yaranmasına Surxay səbəb olmuşdu*. Ə.Vəliyev.

3. Bəhanə, əsas, dəlil. *Dava salmaq üçün səbəb axtarır.* ☐ **Səbəb eləmək** – əlində bəhanə eləmək, əsas eləmək. [Güllü] *bu kiçik çöpü, nə üçünsə, böyük bir səbəb eləmək istəyirdi*. H.Seyidbəyli.

4. **...səbəbinə** şəklində – ...sayəsində, ...görə, ...ucbatından, ...hesabına. [Usta arvadına:] *Belə kef! Özü də ayrı adamları* [cənnətə] *qoymazlar, biz ağanın səbəbinə gedəcəyik..* Çəmənzəminli.

◊ **Bu səbəbə** – bu səbəbdən, buna görə, bu üzdən. **Nə səbəb (səbəbə, səbəbdən)** – nə üçün, niyə. *Nöqsanımı gördün sənə ixlas də əfzun, Lütfün nə səbəbdən belə, ey məh, kəm olubdur.* S.Ə.Şirvani. *...Biz düz adam olsaq, nə səbəbə biz dara düşəndə və ehtiyac məqamında Allahı yada salırıq?* C.Məmmədquluzadə. **O səbəbə (ki)** – ona görə (ki)... *Qış fəsli nə qədər gözəl olsa da, yenə də bahar fəslinə bərəkət. O səbəbə ki, baharda ot*

*bitir və acların dəxi Bakı milyonçularına ehtiyacı olmur.* C.Məmmədquluzadə.

**SƏBƏBKAR** *is.* [*ər.* səbəb və *fars.* ...kar] Bir şeyə səbəb olan, bais olan adam; təqsirkar. [Şəhrəbanu xanım:] *Bəli, dəxi necə edək, Allah səbəbkara bəla versin!* M.F.Axundzadə. [Gülzada:] [Səlbinin] *..uşaqları çörək istəyəndə baisə, səbəbkara ağzından gələni deyib.* Ə.Vəliyev. [Səməndər] *özünü bütün bu xoşagəlməz hadisələrə səbəbkar bilirdi.* B.Bayramov.

**SƏBƏBKARLIQ** *is.* Səbəbkar olma, bais olma; təqsirlilik.

**SƏBƏBLİ** *sif.* Müəyyən səbəbi olan, üzürlü.

**SƏBƏBSİZ** *sif.* və *zərf* Heç bir səbəb olmadan, heç bir əsas olmadan, nahaq yerə. *Səbəbsiz işdən qalmaq. Səbəbsiz gülmək.* – *Biri səbəbsiz ağlar; Biri bərk yıxılanda; Üzə vurmaz, ağartmaz!* R.Rza. [Sultan:] *Axı mən səbəbsiz hücum eləmirəm, oğul!* İ.Hüseynov.

**SƏBƏT** *is.* İçinə meyvə, göyərti və s. yığmaq üçün qarğıdan, qamışdan və s.-dən hörülən uzunsov zənbil. *Bir səbət üzüm. Bir səbət əncir.* – [Kəndçi] *xurcunun hər gözündə bir yekə səbət nar yerləşdirmişdi*. Qantəmir. *Məşədi Şərif içalatı iri bir səbətə qoyub həyətə salladı*. Ə.Vəliyev.

**səbət-səbət** *zərf* Səbətlərlə, səbətlər dolusu. *Səbət-səbət üzüm. Səbət-səbət gilas.* – *Edqar .. səbət-səbət meyvə daşıyan .. ərbləri qonağından gizlədə bilməmişdi.* S.Vəliyev.

**SƏBƏTCİK** *is.* Balaca səbət.

**SƏBƏTÇİ** *is.* Səbətdə gəzdirib şey satan adam.

**SƏBƏTTOXUYAN** *is.* Peşəkar səbət toxuyan.

**SƏBİ** *is.* [*ər.*] 1. Məğlub edilmiş tərəfdən əsir tutulub satılan adam.

2. Həddi-büluğa çatmamış oğlan; gənc, uşaq.

**SƏBİR**[1] *is.* [*ər.*] 1. Xoşagəlməz, acı, haqsızlıq kimi üzücü hallar qarşısında səsini çıxarmadan onların keçib-getməsinə dözmə, təhəmmül etmə. *Bir dərd var ki, yerə-göyə sığışmayan, ürək yandıran, insanı vərəmləndirən, səbir və təskinlik bilməyən; məsələn, birinin əziz bir övladı əlindən gedə...* C.Məmmədquluzadə. □ **Səbir etmək (eləmək)** – çətin iş, ağır vəziyyət və s. hallarda şikayətlənmədən dözmək, təhəmmül etmək. *Bu söz-söhbətlərin, müamilə və rəftarın nə qədər Süreyyaya acı təsiri olurdusa da, səbir eləyirdi.* Çəmənzəminli. // Gələcək və olacaq bir şey üçün tələsməyib və təlaş göstərməyib gözləmə; hövsələ. □ **Səbir etmək** – dözmək, hövsələ etmək, tələsmədən gözləmək. *Lakin səbrin də bir dərəcəsi vardır.* M.S.Ordubadi. *İskəndər səbir edib, yarım ilə qədər gözlədi. Canına qulluq eləyib əkinəbiçinə getdi.* M.Hüseyn. **Səbri kəsilmək (tükənmək)** – artıq dözə bilməmək, təhəmmül edə bilməmək. *Səbrim kəsilib, yar mənim canımı alsın; Ya şad eləsin vəsl ilə, didarə yetirsin.* Heyran xanım. [Nofəl Zeydə:] *Burax atların cilovunu, Zeyd, kəsdiyimiz çörəyə and içirəm ki, artıq mənim səbrim tükənmək üzrədir.* Ə.Məmmədxanlı. **Səbrini basmaq** – b a x **səbir etmək**. [Bədircahan:] *Səbrini bas, ağa, hesabına bax!* N.Vəzirov. [Rəşid:] *Mən birtəhər səbrimi basıb, xörəkdən yeməyə başladım*. İ.Hüseynov.

2. **Səbirlə** şəklində *zərf* – təmkinlə, ağırağır. *Səbirlə nağıl etmək.* – *Səbirlə toplamışdır gücünü damla-damla; Danışıb öz diliylə hər kəslə, hər adamla.* R.Rza. [Qoşqar Əmirliyə:] *Düz bir ildir, mən bu aparatda işləyirəm, bir dəfə görməmişəm ki, mənimlə səbirlə, soyuqqanlı danışasınız.* İ.Hüseynov.

◊ **Səbir kasası daşmaq (dolmaq)** – daha dözə bilməmək, təhəmmül edə bilməmək, hövsələdən çıxmaq, təmkinini itirmək. [Gövhər xanım:] *Daha bəsdir! Səbir kasam dolub daşmış*. S.S.Axundov. *Molla Şirəlinin səbir kasası daşdı, onsuz da gərgin olan əsəbləri qırıldı.* S.Rəhman.

**SƏBİR**[2] *is.* Asqırma, asqırtı, asqırıq.

◊ **Səbir gətirmək** – asqırmaq. **Tək səbir, cüt səbir** – xalq arasında: guya bir dəfə asqırma nəhslik, uğursuzluq; cüt asqırma isə xeyir, uğur əlamətidir. *Ta gəlirik biz də bir az anlayaq; Məhzəri-irfanda vurur tək səbir.* M.Ə.Sabir.

**SƏBİR-ARAM** b a x **səbir-qərar**. *Səbirarамı qalmamaq*. – [Əbülhəsənbəy:] *Səbrimaramım yox idi, çünki yoldaşları böyük təhlükə gözləyirdi.* M.S.Ordubadi.

**SƏBİR-QƏRAR, SƏBRÜ QƏRAR** *is.* Səbir, təmkin, hövsələ, təhəmmül. *Ey sevdiyim, səndən cüda düşəli; Nə səbrü qərarım, nə taqətim var.* Q.Zakir.

**SƏBİRLİ** *sif.* Səbri olan, səbir edən, təlaş və məyusluq və ya hövsələsizlik göstərməyib mətanətlə dözən, dözümlü. *O, çox səbirli adamdır.* – [Şahin Firəngizə:] *Siz çox səbirli adamsınız, yoldaş Qaradağlı, mənim bağrım çatlayır, bu saat boğazımdan heç su da keçməz.* B.Bayramov.

**SƏBİRSİZ** 1. *sif.* Səbri olmayan, hövsələsiz, dözümsüz, tələsən. *Səbirsiz adam.*

2. Bax **səbirsizliklə** (“**səbirsizlik**”də). *Qız anasını harada axtaracağını bilməyərək, səbirsiz gözləməyə başladı.* T.Ş.Simurq. *Toplaşmışdıq, oturmuşduq; Gözləyirdik hey səbirsiz.* N.Rəfibəyli.

**SƏBİRSİZLƏNMƏ** “Səbirsizlənmək”dən *f.is.*

**SƏBİRSİZLƏNMƏK** *f.* Özünü saxlaya bilməyib haldan çıxmaq, səbirsizlik göstərmək, səbirsiz olmaq, hövsələdən çıxmaq. *Gündə bir dəfə qəzet idarəsinə baş çəkən Müsyö Qamel çox səbirsizlənirdi.* Qantəmir. *Bu fikirlə qarı oğlunu dinləyir, tez-tez ərinə baxaraq onun sözə başlaması üçün səbirsizlənirdi.* Ə.Əbülhəsən.

**SƏBİRSİZLİK** *is.* 1. Səbri olmama, səbir edə bilməmə, bir yerdə aram tapa bilməmə, hövsələsizlik, qərarsızlıq. *Oğul, səbirsizlik adama həmişə ziyan verər.* “Koroğlu”.

2. Daxili həyəcan və iztirab, narahatlıq. *Bütün günü səbirsizlik içində olmaq.*

3. **Səbirsizliklə** şəklində *zərf* – təlaşla, həyəcanla, təlaş və həyəcan içində. *Nadir isə başını aşağı dikib diqqətlə dinləyirdi və böyük səbirsizliklə bu söhbətin sonunu gözləyirdi.* B.Talıblı. *Dəmirqaya ön sırada oturub səbirsizliklə məhkəmənin başlanmasını gözləyirdi.* H.Nəzərli. *Aslan səbirsizliklə* [Lazarın] *sözünü kəsib, incimiş halda dedi.* S.Vəliyev.

**SƏBT** *is.* [*ər.*]: **səbt etmək** – qeyd etmək, yazmaq. *Od tutar kağızlar, alışar qələm; Səbt etsələr hər tumara dərdimi.* Q.Zakir. *Zəbaniərzi-halə cürətim yoxdur, deyim, axır; Bu üzdən səbt edib dərdi-dilim tumarə, göndərdim.* S.Ə.Şirvani. **Səbt olunmaq** – qeyd edilmək, yazılmaq. *Çox şairlərin əşarı* [Mirzə Səfərin] *sinə dəftərində səbt olunmuşdu.* Ə.Haqverdiyev.

**SƏBUHİ** *sif.* [*ər.*] Səhərə aid olan, sübhə mənsub olan.

**SƏBZƏ** *is.* [*fars.*] 1. Əla kişmiş növü. *Süfrədə tut qurusu, miyanpur, innab, ləbləbi, kişmiş, səbzə, alma, portağal da olardı.* H.Sarabski.

2. Göyərti, göylük, göyərtilik, yaşıllıq, çəmən. *Rahat üçün fərş salmış səbzeyi-tər gülşənə.* Füzuli. *Dörd tərəfi səbzə bağlı; Bu Azərbaycana baxın.* Aşıq Əsəd.

**SƏBZƏLİ** *sif.* Tərkibində səbzi (göyərti) olan; göyərtili. *Səbzəli qovurma.*

**SƏBZƏVAT** [*fars.* səbzə və *ər.* ...at] Müxtəlif göyərtilər (səbzilər), göy-göyərti. [Koroğlu] *ətrafa göz gəzdirib baxdı ki, yanında bir səbzəvat dükanı var.* “Koroğlu”.

**SƏBZƏVATÇI** *is.* Səbzi (göyərti) yetişdirib satan adam; göyərtiçi.

**SƏBZƏVATÇILIQ** *is.* Səbzi (göyərti) əkib satmaqla məşğul olma; göyərtiçilik. *Səbzəvatçılıq etmək.*

**SƏBZİ** *is.* 1. Göyərti. *Yeməklər yenə də düyü, ət, toyuq, yumurta və səbzilərdən bişirilmiş Təbriz xörəkləri idi.* M.S.Ordubadi.

2. Bax **səbzə** 1-ci mənada. *Məcməyidə səbzi, iydə, səməni, sumaq, ayna və təhvil balığı vardı.* P.Makulu.

**SƏBZİQOVURMA** *is.* Göyərti ilə ətdən bişirilən qovurma. *Plovu səbziqovurma ilə yemək. – Usta qatıq kasasını .. səbziqovurmanın üstünə töküb ağız ləzzəti ilə yedi.* M.Süleymanov.

**SƏBZİQOVURMALI** *sif.* Xuruşu səbziqovurma olan. *Səbziqovurmalı plov.*

**SƏBZİQOVURMALIQ** *sif.* Səbziqovurma bişirməyə yarar. *Səbziqovurmalıq ət. Səbziqovurmalıq göyərti.*

**SƏBZİYYAT** [*fars.* səbzi və *ər.* ...iyyat] bax **səbzəvat**. *Yolun bir tərəfində müsəlmanlar səbziyyat əkirdilər.* Ə.Haqverdiyev.

**SƏCCADƏ** *is.* [*ər.*] *din.* Mömin müsəlmanların namaz qılanda istifadə etdikləri kiçik xalça və ya parçadan tikilmiş döşənək; canamaz. *Bununla bərabər hacı dayım o qədər mömin və o qədər namaz qılan idi ki, səhərdən axşamadək səccadə qabağında namaz qılardı.* C.Məmmədquluzadə. *Hacının dəs-*

*təmaz suyu hələ qurumamışdı ki, səccadəni* [sərib] *müqəddəs əqidə ilə namaza şüru etdi.* Çəmənzəminli. *Bütün varım-yoxum bir əba, bir səccadə, bir kəşkül və bir də nacaqdan* (*təbərzindən*) *ibarətdir.* N.Vəzirov.

**SƏCDƏ** *is.* [*ər.*] *din.* Namazda alını möhürə söykəyib, Quranın bəzi ayələrini oxuyarkən alnını ona söykəyib dua oxuma. *Məhəmmədhəsən əmi səbir eləyə bilməyib, ikinci səcdədə namazı yarımçıq qoyub özünü tulladı Əhmədin yanına*. C.Məmmədquluzadə. ◻ **Səcdə etmək (qılmaq)** – qabağında baş əymək, təzim etmək. *Səcdə qıl yarə, könül, baxma o zahid sözünə; Adəm ol, mətləbi qan, eyləmə şeytan ilə bəhs.* S.Ə.Şirvani. *Qəmgin idim, sizi görüb gülərəm; Qiblədir qaşların, səcdə qılaram.* Aşıq Ələsgər. [Hüseyn:] *Nə zaman, harada əmr etsəniz, önünüzdə səcdə etməyə hazıram*. S.Rəhman. **Səcdəyə düşmək (getmək)** – b a x **səcdə etmək**. *Düşüb səcdəyə cümlə ixlas ilə; Niyaz etdilər niyyəti-xas ilə.* M.Ə.Sabir. [Murad bəy] *..damağında papiros çöl balkona çıxanda camaat səcdəyə gedərdi*. Qantəmir.

**SƏCİYYƏ** *is.* [*ər.*] 1. Hər hansı bir şeyin və ya hadisənin başqalarından fərqləndirən xüsusiyyəti; xarakter. *Hadisənin səciyyəsi. Ərazinin səciyyəsi*.

2. Xasiyyət, təbiət. *Başqa-başqa səciyyəyə malik bu adamların adları da səciyyələrinə müvafiq idi*. Çəmənzəminli.

**SƏCİYYƏLƏNDİRMƏ** "Səciyyələndirmək"dən *f.is.*

**SƏCİYYƏLƏNDİRMƏK** *f.* Bir şeyin səciyyəvi xüsusiyyətlərini vermək, göstərmək. // Bir şəxsin və ya şeyin fərqləndirici xüsusiyyətini təşkil etmək.

**SƏCİYYƏLƏNMƏ** "Səciyyələnmək"dən *f.is.*

**SƏCİYYƏLƏNMƏK** *f.* Səciyyəvi xüsusiyyətlərilə fərqlənmək, başqalarında olmayan səciyyəvi xüsusiyyətlərə malik olmaq. *Azərbaycan ədəbiyyatı tarixində bu dövr bir tərəfdən mürəkkəbliyi ilə, ikinci tərəfdən mövcud ədəbi materialların, parlaq ədəbi şəxsiyyətlərin azlığı ilə səciyyələnir.*

**SƏCİYYƏVİ** *sif.* [*ər.*] Bir şəxsə, ya şeyə xas olan, bir şəxsi və ya şeyi başqasından fərqləndirən. *Səciyyəvidir ki, məsələn, Cəlil Məmmədquluzadənin öz əsərlərində hadisələrə xalq və xəlqilik cəbhəsindən yanaşdığı aydın görünür*. M.Hüseyn.

**SƏCİYYƏVİLİK** *is.* Məhz bir şəxsə, bir şeyə, bir dövrə, bir hadisəyə xas olma.

**SƏD** *miqd. s.* [*fars.*] Yüz (adətən afərin, mərhəba, heyif kimi sözlərin əvvəlinə gətirilərək onların təsir gücünü artırmaq üçün nida məqamında işlənir). [Ustadlar:] *Hər görən söyləyə: ay səd afərin! Nəinki məclisdə yüz qanan ola*. "Lətif şah". *Oxudum, öpdüm, gözə sürtdüm, dedim: səd mərhəba! Gözüm üstə var yerin, ey gülüzarın kağızı!* M.P.Vaqif. *Məst olmadığım dəm yox idi dəhrdə bir gün; Səd heyf ölən vəqtdə huşyar ölürəm mən*. S.Ə.Şirvani.

**SƏDA** *is.* [*ər.*] Səs, avaz. *Orkestrin sədası yayıldı. Uşaqların sədası gəlirdi. – Quşlar .. cəh-cəh ilə min cürə nəğmələr oxuyub, meşəni sədaları ilə doldurmuşdular*. A.Divanbəyoğlu. *Melodiyanın ilk sədaları təzəcə dilə gəlmişdi..* Ə.Məmmədxanlı. ◻ **Səda düşmək** – səs düşmək, yayılmaq. *Hər yana səda düşür; İgidlər gəlir məclisə.* Aşıq Ələsgər. *Qar əriyir, çaylar daşır; Dağa-daşa düşür səda*. B.Vahabzadə. **Səda etmək** – səsləmək, çağırmaq. *Mollabaşının təhriki olmamış da bu halda kəmali-qeyz ona üz verib, Xacə Mübaraki qaim sövt ilə səda etdi*. M.F.Axundzadə. **Səda salmaq** – 1) səs salmaq, gurultu qopartmaq, hay-küy qopartmaq. *Göyün dağlara səda salan dəhşətli şaqqıltısı .. bir qızı yox, bütün kişiləri də qorxuya salır.* S.S.Axundov. *Deyirlər, qəlbində bir vulkan gömülü; Şir kimi nərə çək, səda sal cahana!* M.Müşfiq; 2) *məc.* məşhurlaşmaq, gurultu qoparmaq. *Onun qüvvəsilə sənin dəmirin; Ölkəmizə səda salır, Daşkəsən!* Aşıq Məsum.

**SƏDAQƏT** *is.* [*ər.*] Dostluqda, məhəbbətdə dəyanət, səbat, vəfa; sadiqlik, etibarlılıq. *Ürək özünündür, özün bilərsən; Mənimsə əhdimə sədaqətim var.* S.Rüstəm. *Mən vermişəm ürəyimi yadigar sənə; Sənin mənə yadigarın sədaqətindir.* N.Xəzri.

**SƏDAQƏTLİLİK** *is.* Sadiq (sədaqətli) olma, etibarlılıq, vəfalılıq, vəfadarlıq.

**SƏDAQƏTSİZ** *sif.* Dostluğunda, məhəbbətində sadiq olmayan; etibarsız, vəfasız. *Sədaqətsiz yoldaş.*

**SƏDAQƏTSİZLİK** *is.* Dostluqda, məhəbbətdə sadiq olmama; etibarsızlıq, vəfasızlıq.

**SƏDARƏT** *is.* [*ər.*] Başçılıq, sədrlik, rəislik. *Sədarət sandalyasında Koroğlu əyləşir, qalanları da iki tərəfdən əyləşirlər.* Ə.Haqverdiyev. ☐ **Sədarət etmək** – sədrlik etmək, başçılıq etmək. *İclasa sədarət etmək. – Dəccal bu məclisdə sədarət edir.* Ə.Haqverdiyev. **Sədarətə keçmək (çıxmaq)** – sədr seçilmək, sədr vəzifəsini ifa etməyə başlamaq, başçılıq etməyə başlamaq, bir işin başına keçmək. *Ömər sədarətə çıxdıqda ürəklərə fərəh yayıldı.* Çəmənzəminli. *Cəmil sədarətə keçəndən sonra suala cavab verməyə başladı.* Mir Cəlal.

**SƏDBƏR(G)** *is.* [*fars.*] *bot.* bax **mixəkgülü**. *Sədbər və ya mixəkgülü .. birillik bozumtul, keçətüklü, budaqlı bitkidir.* M.Qasımov.

**SƏDD** *is.* [*ər.*] 1. Müxtəlif məqsədlər üçün çəkilən divar, hasar. *Bütün sədd boyu dalbadal atılan tüfənglərin arası kəsilmir.* M.Rzaquluzadə. *Minlərlə insan yorulmadan sədlər qururdu.* M.Süleymanov.

2. Suyun qarşısını almaq üçün betondan divar; dəhnə, bənd. *Çay .. at kimi baş alıb gedir, bəndləri və sədləri uçururdu.* Ə.Vəliyev. *Borulardan sürətlə çıxan su bu beton səddə toxunaraq parçalanacaq və öz sürətini itirəcəkdi.* Ə.Sadıq. *Yaradırıq əməklə; Mingəçevir səddini.* M.Seyidzadə. ☐ **Sədd çəkmək** – suyun qarşısını almaq üçün betondan, sementdən və s.-dən bənd tikmək. *Hər gölməçənin dörd yanına torpaqdan sədd çəkmişdilər.* M.Hüseyn. *Ənvər camaatı yığıb sədd çəkirdi.* Ə.Vəliyev.

3. *məc.* Maneə. *Bir neçə dəqiqə içərisində Məşədi bəylə müəllim arasında sədd uçub töküldü.* M.Hüseyn. *Abdulla ilə öz arasında böyük sədd saydığı Leyla* [Şəkərin] *fikrincə aradan çıxırdı.* B.Bayramov.

◊ **Səddi-Çin, Çin səddi** – xarici təsirdən tamamilə təcrid olunma mənasında (Çini Monqolustandan ayıran qədim bir səddin adından). **Səddi-İskəndər** (Makedoniyalı İskəndərin adından) – çox möhkəm divar mənasında. *Atasının keçmişdə Kərbəlaya ziyarətə getməyi bu gün Mirzə Süleyman bəyin bütün amal, əfkarının qarşısında Səddi-İskəndər kimi durub, onun gözəl məqsədinə nail olmağına mane olurdu.* B.Talıblı.

**SƏDƏF** *is.* [*ər.*] Bəzi balıqqulağıların iç qatını təşkil edən və müxtəlif bəzək şeyləri hazırlamaq üçün istifadə edilən, müxtəlif rənglərə çalan parlaq bərk maddə. *Yaxasına hərdən-hərdən; İnci sədəf düzən gözəl!* Aşıq Ələsgər. *İmi çəhrayı atlaz örtüyü açıb, başdan-başa sədəfə tutulmuş tarını ehtiyatla çıxartdı.* İ.Əfəndiyev. // Sədəfdən qayrılmış, sədəflə bəzədilmiş. *Sədəf düymə. Sədəf qaval. – Səba xanım öz etidalını itirmədi. Kamançanı götürüb başındakı sədəf qübbəni çıxardı, onun içərisindən kiçik bir məktub çıxarıb Atabəyə uzatdı.* M.S.Ordubadi. *Tarçı, köklə sarı simi; Bir şey çal ellər eşqinə! Durma, köklə sədəf tarı.* M.Müşfiq. // *məc.* Öz parlaqlığı, zərifliyi, rənginin saflığı ilə sədəfi xatırladan (bəzən obrazlı təşbehlərdə işləyir). *Bir şirin göftarlı, bir şəkər sözlü; Ağzı sədəf, dişi dürdanədəndir.* M.V.Vidadi. *Sədəf dəhanından çıxan sözlərin; Hər biri bir qeybixəzanədəndir.* M.P.Vaqif. *Gülzarın süzgün baxışı, yanaqlarının atlaz şəfəqi, gülümsədiyi zaman görünən ağ sədəf dişləri indi də Rüstəmin bu gün səhər gördüyü kimi qarşısında idi.* T.Ş.Simurq. ☐ **Sədəf kimi** – ağ, parlaq. *Onun sədəf kimi ağ dişləri parıldayır, iki ala gözləri dərin bir səmimiyyətlə alışıb yanırdı.* M.Hüseyn. *..Güləndə dodaqlarının arasından sədəf kimi saf dişləri ağarırdı.* M.Rzaquluzadə. **Sədəf saçmaq (səpmək)** – nur saçmaq, işıqlandırmaq, parıldatmaq. *Gündüz yağan qar toxtamış, Ay aləmə sədəf saçırdı.* Çəmənzəminli.

**SƏDƏFGÜLÜ, SƏDƏFOTU** *is. bot.* Limonkimilər fəsiləsindən tərkibində efir yağı olan ağçiçəkli yarımkol bitkisi.

**SƏDƏFLİ** *sif.* Sədəflə bəzədilmiş, sədəfə tutulmuş. *Sədəfli tar. Sədəfli mücrü. –* [Rəsul:] *Əlimə almışam sədəfli sazı; Fələk yazdı mənə belə bir yazı.* "Aşıq Qərib". *Vətən sədasına düşən sənətkar; De, indi nə çalır sədəfli sazın?* S.Vurğun.

**SƏDƏQƏ** *is.* [*ər.*] Yoxsula, dilənçiyə verilən pul, şey. *Sədəqə vermək. Sədəqə paylamaq. – Yolun o tay-bu tayında hasar təşkil edən dilənçilər, kor və şillər .. sədəqə diləyirdilər.* Çəmənzəminli. *Tapdıq olanda Göyçək çoxlu sədəqə paylamışdı.* Ə.Vəliyev. // *məc.* Qurban edilən şey; qurban. *Müddətdi həsrə-*

*təm, bir gəz bəri bax; O xan gözlərinin sədəqəsi canım*. Q.Zakir.

**SƏDƏMƏ** *is.* [*ər.*] 1. Çarpma, vurma, şiddətlə vurma.

2. *məc.* Gözlənilmədən başa gələn bəla, müsibət, fəlakət, afət; insanın maddi və ya mənəvi halını sarsıdan hadisə; mənəvi zərbə. *Fəqət, görürsünüz, bədən ruzgarın sədəmələrinə davam etməyir*. N.Nərimanov. ◻ **Sədəmə toxunmaq** – fəlakətə məruz qalmaq, bəla üz vermək, zərər dəymək, zərbə dəymək. [Qəhrəman:] *Balaca Sabirə heç bir şey olmasın. Ona bir sədəmə toxunmasın*. S.Rəhimov. [Hacı Rəsul:] *Başımdan on beş dava keçib, bu az ömrümdə on beş padşah dəyişib, amma heç mənə sədəməsi toxunmayıb*. Mir Cəlal.

**SƏDR** *is.* [*ər.*] 1. İclasa, yığıncağa başçılıq edən şəxs. *Sədr iclası açdı. İclasa sədr seçmək.*

2. Dövlət, hökumət və ya ali dövlət orqanları rəhbərlərinin rəsmi adlarının tərkibində. *Milli Məclisin Sədri. Nazirlər Sovetinin Sədri.* // Bəzi idarələrin, təşkilatların, cəmiyyətlərin və şöbələrin rəhbəri, başçısı. *Kolxoz sədri. Yerli komitə sədri. – Rüstəm kişi .. rayon icraiyyə komitəsi sədrinin yanına getməyi qərara aldı*. M.İbrahimov.

**SƏDRİ** *is.* [*ər.*] Uzun, nazik, sarıyaçalar düyü növü. *Sədri düyüsündən plov*.

**SƏDRLİK** *is.* Sədr vəzifəsi, sədr olma. [Alxan:] *Gəlin bu elmli oğlanlardan birini keçirdək sədrliyə*. İ.Əfəndiyev. ◻ **Sədrlik etmək** – sədr vəzifəsini ifa etmək, sədr olmaq, başçılıq etmək. *Atası Mahmudalı kişi sədrlik eləyəndə, Şamama* "*atama kömək edirəm*", *– deyə həvəslə pambıq yığardı*. Ə.Əbülhəsən.

**SƏDULU** *is.* Azərbaycanlıların etnogenezində iştirak etmiş türk tayfalarından birinin adı.

**SƏF** *is.* [*ər.*] Sıra, cərgə, düzgü. *Elə ki səflər düzəldi, dəstələr hərə öz yerini tutdu, Koroğlu Tanrıtanımazı çağırdı*. "Koroğlu". // Qatar. *Saqın gəzin, laçın gözü görməsin; Qorxuram, səfinizi poza, durnalar!* M.P.Vaqif. ◻ **Səf bağlamaq (düzmək, çəkmək**) – sıraya düzülmək, cərgə-cərgə durmaq. *Qarabaşlar əlləri döşlərində səf çəkib, xanımları gözləyirdilər*. Çəmənzəminli. *Buğac atasının əlindən tutub bir neçə addım kənara çəkildi və səf çəkib yarımdairə vurmuş igidlərinə əlilə bir işarə etdi*. M.Rzaquluzadə.

**SƏFA** *is.* [*ər.*] Zövq, nəşə, ləzzət, kef; rahatlıq (adətən feillərlə işlənir). *Səfa görmək. Səfa vermək. Səfa çəkmək. Səfa sürmək. – Çəkdim yar cəfasını; Görmədim səfasını, Siz tanrı, qoyun gedim; Bir bilim vəfasını*. (Bayatı). *Kim qaytarır bir də bizə gəncliyi; Bu dünyanın səfasını sürməsən?* R.Rza. // Şənlik, əyləncə.

◊ **Səfa gətirdin!** – birinin salamına verilən qarşılıq söz.

**SƏFAHƏT** *is.* [*ər.*] 1. Səfehlik. *Güldü bir qədər onun səfahətinə; Dərkinə, fəhminə, fərasətinə*. A.Səhhət.

2. Zövq, əyləncə, kef düşkünlüyü, vaxtını bu cür işlərdə keçirmə. [Müfti:] *Sərxoş olub aləmi sərsəmlədir; Anlayamam mən, bu səfahət nədir?* H.Cavid.

**SƏFALƏT** *is.* [*ər.*] Son dərəcə ehtiyac içərisində yaşama, sıxıntı çəkmə; yoxsulluq və ehtiyacdan çəkilən sıxıntı. *Əyyaşlığın sonu yorğunluq və səfalət, səfalətin sonu heçlik və fəlakətdir*. A.Şaiq. [Məsmə:] *Düşdüyüm mühit məni zillət və səfalət içində sürünməyə məhkum etmişdi*. S.Hüseyn. // Düşkünlük, səfillik, səfil həyat. *Səfalət içində yaşamaq*.

**SƏFALI** *sif.* Səfa verən, zövq verən, ləzzət verən, ürəkaçan, xoşagələn, xoş. *Fəsillərin ən gözəli, ən səfalısı bahar vaxtı olduğundan o tərəf-bu tərəf yaşıl otlar, əlvan çiçəklər ilə bəzənmişdi.* T.Ş.Simurq. *Yayın səfalı, lətif bir günü idi*. S.Hüseyn. // Xoş mənzərəli, axar-baxarlı. *Səfalı yer. Səfalı mənzərə. Səfalı təbiət*. – [Səfərli Aydına:] *Dağların döşündə .. səfalı istirahət evləri tikiləcək*. H.Seyidbəyli.

**SƏFARƏT** [*ər.*] b a x **səfirlik** 1-ci mənada. *Rzaquluxan, səfarət ümurunda təcrübəm yox deyə, səfarətdən büsbütün imtina edirdi.* M.S.Ordubadi.

**SƏFARƏTXANA** *is.* [*ər.* səfarət və *fars.* ...xanə] Səfirliyin yerləşdiyi bina, səfirin idarəsi. *İngilis səfarətxanasının binası Tehranın şimal tərəfində ən gözəl məhəllələrin birində yerləşirdi*. P.Makulu.

**SƏFBƏSƏF** *zərf* [*ər.* səf və *fars.* bitişdirici bə] Cərgə-cərgə, sıra-sıra. [Göyxallı at]

*öz səsiylə balaca şəhəri ayağa qaldırdı. Demək olar ki, küçənin o tay-bu tayı səfbəsəf tamaşaya çıxdı.* S.Rəhimov. *İgidlər başaçıq durub səfbəsəf; Baxdılar hüzn ilə gündoğan tərəf.* M.Rahim.

**SƏFEH** *sif.* [*ər.*] 1. Gic, ağıldan kəm, axmaq, sarsaq. *Səfeh adam. Səfeh iş.* – [Hacı Mehdi:] *Səfeh şeydir, gündə biri gəlir, çığırır-bağırır, gedir.* Ə.Haqverdiyev. // İs. mənasında. *O ki Səfdərqulu ağanın oğludur, o da səfehin birisidir; veyil-veyil gəzməkdən savayı bir işi yoxdur.* N.Vəzirov. // Zərf mənasında. *Səfeh danışmaq. Səfeh iş görmək.*

2. Vecsiz, mənasız, boş, yaramaz. *Səfeh hərəkət. Səfeh söhbətlər.* // Bəzən söyüş kimi işlənir. *Nə eyib olacaq, səfeh, sənə deyirəm ki, olmaz da!* E.Sultanov.

**SƏFEHCƏ(SİNƏ)** *zərf* Səfeh kimi, gic kimi, ağılsızcasına, axmaqcasına, sarsaqcasına. *Səfehcəsinə iş tutmaq, Səfehcəsinə inad göstərmək.*

**SƏFEHLƏMƏ** "Səfehləmək"dən *f.is.*

**SƏFEHLƏMƏK** *f.* Gicləşmək, axmaqlamaq, sarsaqlamaq. // Səfeh hərəkət etmək, səfeh sözlər demək.

**SƏFEHLİK** *is.* Ağıldankəmlik, giclik, axmaqlıq, sarsaqlıq. *Səfehliyindən bəlaya düşmək.* – [2-ci əcinnə:] *Özünü vurubsan səfehliyə, xanımın xoşuna gəlib, səni çörəkləyib saxlayır.* Ə.Haqverdiyev. // Səfeh hərəkət, səfeh iş. ☐ **Səfehlik eləmək** – səfeh iş tutmaq, qanmazlıq etmək, ağılsızlıq göstərmək. [Allahqulu:] *Mən lap nahaqdan o acgöz hacının felinə uyub, səfehlik elədim.* Ə.Əbülhəsən.

**SƏFƏR**[1] *is.* [*ər.*] 1. Səyahət, yola çıxma, yol. *Səfərdə olmaq. Səfərə getmək. Səfər üçün hazırlıq görmək. – Qəribin anası gördü ki, oğlu səfər libasındadır, xəbər aldı: – Oğul haraya gedirsən?* "Aşıq Qərib". *..Üç gün idi ki, Gülpəri səfərə yığışırdı.* S.S.Axundov. [Tahirzadənin] *İraq, İran və Türküstan səfərlərində addımbaşı rast gəldiyi cansıxan lövhələr bir-bir gəlib nəzərində dayandı.* Mir Cəlal. ☐ **Səfər etmək** – b a x **səfərə çıxmaq**. *Gördüm ki, gəlir təngə nigarım, səfər etdim.* S.Ə.Şirvani. [Rəhim xan Cavad xana:] *Hazırlaş, bu gün axşam Tehrana səfər etməlisən.* C.Cabbarlı. **Səfərə çıxmaq (getmək)** – uzun müddət olduğu yerdən ayrılmaq, yolda olmaq. [Həmzə] *belə bir səfərə çıxmaq üçün cahan müharibəsinin kəsilməsini, dünyanın düzəlməsini səbirsizliklə gözləyirdi.* Ə.Əbülhəsən.

2. Müharibəyə, döyüşə getmə.

**SƏFƏR**[2] *is.* [*ər.*] Dəfə, kərə, yol. [Nazir:] *Ağa, başına dönüm, bu səfər məni bağışla, dəxi bundan sonra heç vaxt belə iş olmaz.* M.F.Axundzadə. [Əsgər:] *Xanım, sizə yaraşan şeyim çoxdur, ancaq evdədir, inşallah, gələn səfər gətirərəm.* Ü.Hacıbəyov. *Budur ki,* [Əhməd] *nişanlısı ilə görüşüb və toy tədarükü görmək söhbətini gələn səfərə buraxaraq bollu qaçaq mal almağı qət etdi.* B.Talıblı.

**SƏFƏR**[3] *is.* [*ər.*] Hicri qəməri ərəb təqviminin ikinci ayı.

**SƏFƏRBƏR** *sif.* [*ər.* səfər və *fars.* ...bər] Müharibə elanı ilə əlaqədar olaraq hazır vəziyyətə gətirilmiş. ☐ **Səfərbər etmək** – 1) müharibə elanı ilə əlaqədar olaraq ölkənin əsgəri və maddi ehtiyatlarını toplayıb hazır vəziyyətə gətirmək, xalq təsərrüfatının bütün sahələrini hərbi vəziyyətə keçirmək. *Əsgəri qüvvələri səfərbər etmək. Sənayeni səfərbər etmək. Ölkəni səfərbər etmək. Bütün imkanları səfərbər etmək;* 2) *məc.* hər hansı vacib bir işi, yaxud kütləvi tədbiri və s. müvəffəqiyyətlə həyata keçirmək üçün adamları, maddi vasitələri fəal bir hala gətirmək.

**SƏFƏRBƏREDİCİ** *sif.* Səfərbər edən, cəlb edən, çağıran. *Səfərbəredici tədbirlər. Səfərbəredici şüarlar.*

**SƏFƏRBƏRLİK** *is.* 1. Müharibə elanı ilə əlaqədar olaraq, ehtiyatda olan müxtəlif yaşlıların və hərbi qulluğa yararlı olanların ordu sıralarına çağırışı. *Səfərbərlik elan olunan gündən Gülpəri heç nəyə əl vurmamışdı.* M.Hüseyn. // *məc.* Hər hansı bir işin, kütləvi tədbirin müvəffəqiyyətlə yerinə yetirilməsi üçün adamları cəlb etmə, səfərbər etmə. *Müharibə dövründə işçi qüvvəsi çatışmadığından, çox vaxt bu işlər səfərbərlik şəklində həyata keçirilirdi.* İ.Şıxlı.

2. Ölkənin sülh vaxtı mövcud olan silahlı qüvvələrini müharibə şəraitinə keçirmə. *Hava qüvvələrinin səfərbərliyi. Ölkənin bütün qüvvələrinin səfərbərliyə götürülməsi.* // Xalq təsərrüfatının bütün sahələrini hərbi vəziyyətə keçirmə.

**SƏFƏRXANA** *is.* [*ər.* səfər və *fars.* ...xanə] *köhn.* Karvansara. [Əhvalat] *vaqe olur Hacı Qurbanın səfərxanasında gecə vaxtı.* N.Vəzirov.

**SƏFƏVİ(LƏR)** [*ər.*] 1501-1737-ci illərdə Azərbaycanda və İranda hakimiyyət sürmüş məşhur azərbaycanlı sülalə.

**SƏFHƏ** *is.* [*ər.*] 1. Hər hansı bir hadisənin, prosesin və s.-nin inkişafında ayrıca mərhələ, dövr, faza.

2. *astr.* Günəşdən işıqlanma və Yerə görə vəziyyətlərindən asılı olaraq Ay və planetlərin müxtəlif dövrələri.

**SƏFİL** *sif.* və *zərf* [*ər.*] Daimi yaşayış yeri olmayan, daimi məşğuliyyəti olmayan, səfalət içərisində yaşayan; avara, sərgərdan, sərsəri, veyil. *Səfil adam. Səfil həyat sürmək. Səfil yaşamaq.* – [Cavanşir bəy Dilaraya:] *Sən o səfil rəssamdan əl çək!* Ə.Məmmədxanlı. [Zeynal:] *Mən əvvəlki səfil və rəzil həyatdan tamamilə əl çəkib sənə tərəf gəlirəm.* S.Hüseyn. *Ata-ana nazı ilə böyümüş Budaq indi çox şeyə tamarzı qalırdı. O, avara, səfil və sərgərdan həyat sürürdü.* Ə.Vəliyev. // İs. mənasında. *Dedik ki, torpaqda nə səfil, nə ac; Nə də bir kimsəsiz görünsün gərək!* S.Vurğun. // Acınacaqlı, müsibətli, fəlakətli; səfalətli. [Qutluq:] *Sən də məni məhv et, rica edirəm. Məni bu səfil həyatın əlindən qurtar.* M.S.Ordubadi.

**SƏFİLANƏ** *zərf* [*ər.* səfil və *fars.* ...anə] Səfilcəsinə, səfalət içərisində, səfil kimi. *Zeynal özü də burasını dərk edirdi ki, xidmətlərinin əlindən çıxması .. həyatını səfilanə keçirməsinə səbəb olmuşdur.* S.Hüseyn. [Mirzə Rza:] *Yazıq balalarım... Çil yavruları kimi hərə bir yana düşmüş, səfilanə sürünürlər.* C.Cabbarlı.

**SƏFİLCƏSİNƏ** *zərf* Səfil kimi, səfil vəziyyətdə, səfilanə, sərsəri kimi, acınacaqlı halda. *Səfilcəsinə küçələri dolaşmaq.* – *Zeynalın, başqa özü kimi səfilcəsinə küçə həyatı keçirən yoldaşları Mehribanın gözü qabağında keflənmişdilər.* S.Hüseyn.

**SƏFİLLİK** *is.* Səfil adamın halı; məskənsizlik, işsizlik, veyillik.

**SƏFİL-SƏRGƏRDAN** *zərf* [*ər.* səfil və *fars.* sərgərdan] Yersiz-yurdsuz, ac, pis vəziyyətdə, acınacaqlı halda. *Səfil-sərgərdan qalmaq.* – [Sevər:] *Ac, səfil-sərgərdan küçələri dolaşıram.* C.Cabbarlı. [Firidun] *bazar və küçələri doldurmuş yurdsuz uşaqlara, səfil-sərgərdan bir halda hər gələnə əl açan qadın və qızlara baxır.* M.İbrahimov.

**SƏFİNƏ** *is.* [*ər.*] *köhn.* 1. Gəmi.

2. Cüng.

**SƏFİR** *is.* [*ər.*] Bir dövlətin digər dövlətdə olan yüksək dərəcəli diplomatik nümayəndəsi, elçisi. *Səfir başda olmaq üzrə .. səfarətxananın işçiləri də təyyarə meydanına gəlmişlər.* M.İbrahimov.

**SƏFİRLİK** *is.* 1. Bir dövlətin başqa dövlətdə səfirin başçılıq etdiyi diplomatik nümayəndəliyi, həmçinin bu nümayəndəliyin yerləşdiyi bina.

2. Səfirin vəzifəsi, işi.

**SƏFRA** [*ər.*] b a x **sifraq**.

**SƏĞİR** *is.* [*ər.*] *köhn.* 1. Azyaşlı, kiçik, balaca, həddi-büluğa çatmamış uşaq. *Pişvazə çıxıb səğirü kəbir; Ucalır ərşə naleyi-təkbir.* S.Ə.Şirvani. [Molla Zaman:] [Həmidin] *xoşbəxtliyi ondadır ki, səğirdir.* Ə.Haqverdiyev.

2. Həddi-büluğa çatmamış və qəyyuma möhtac olan yetim. *Xudayar bəyin qəsdi Zeynəbin və səğirlərin var-yoxuna, puluna və mülkünə sahib olub Zeynəbi çölə ötürmək idi.* C.Məmmədquluzadə.

**SƏHƏNG** *is.* Su daşımaq üçün misdən və ya gildən qayrılmış qulplu, qarınlı, darboğaz qab; güyüm. *Mis səhəng. Saxsı səhəng.* – *Su səhəngi suda sınar.* (Məsəl). *Bulaşıqlı səhəngdən bulanıq su tökülər.* (Məsəl). *..Əmim arvadı iri mis səhəngi çiynimə verib, səhərdən axşama qədər mənə ayaqyalın, başaçıq su daşıtdırardı.* İ.Əfəndiyev.

**SƏHƏR** *is.* [*ər.*] Günün başlanğıcı, ilk saatları, sabah açıldığı vaxt, sübh. *Səhər yuxusu. Səhər soyuğu. Səhər tezdən durmaq. Səhər yeməyi. Səhərdən işləmək.* – *Səhər Sona yuxudan ayılıb medalyonu açıq gördü.* N.Nərimanov. *Səhər yeli nəğmələr; Pıçıldayır güllərə; Elə bil ki, mənimçin; Bəzənib gözəlləşir.* N.Xəzri.

**SƏHƏR-AXŞAM** *zərf* Həm səhər, həm axşam; hər vaxt, hər zaman, bütün günü. *Dənizkənarı park səhər-axşam adamlarla dolu olur. Qız anasına səhər-axşam baş çəkir.* – *Göyərçin hər səhər-axşam Araz sahilinə uçub, bir*

*müddət o tayı seyr edir.* M.Rzaquluzadə. *Dəniz dalğalanar hər səhər-axşam; Qarı əridikcə uca zirvənin.* N.Xəzri.

**SƏHƏRCİK** *is.* Əsasən uşaqlar üçün düzəldilən səhər müsamirəsi, səhər tamaşası. *Parkda uşaq səhərciyi keçirilirdi.*

**SƏHƏRKİ** *sif.* Səhər vaxtı olmuş, səhər baş vermiş. *Səhərki yağış. Səhərki söhbət. Səhərki yığıncaq. – Analar körpələrini yatırdır, briqadirlər sabahkı iş üçün fikirləşir, manqabaşçıları səhərki tapşırığı üzvlərinə xəbər verirlər.* Ə.Vəliyev.

**SƏHƏR-SƏHƏR** *zərf* Səhər vaxtı, səhər tezdən, səhər olan kimi, sübhçağı. *Səhər-səhər qapımızın ağzını kəsdi. – Səhər-səhər bağda gəzən nazənin; Dəstinlə qönçəni üz, qadan alım!* Aşıq Ələsgər. *Səhər-səhər "Azərşərabın" müştəriləri* [Cəlilbəyi] *qonaq eləmişdilər.* S.Rəhman.

**SƏHHƏT** *is.* [*ər.*] Sağlamlıq, cansağlığı. *Səhhəti pozulmaq. Səhhətini qorumaq. – Gülnaz indi qalın cildli bir kitabı vərəqləyir, uşaq səhhətinə aid şəkillərə baxırdı.* S.Rəhimov. *Canına bax, elə olsun səhhətinə ziyan olmasın.* Mir Cəlal. ☐ **Səhhət tapmaq** – sağalmaq, yaxşı olmaq, şəfa tapmaq. [Fərhad:] *Nəhayət, mən səhhət tapdım.* C.Cabbarlı. *..Molla Cəfərqulu tibb elminə dara olduğundan möhtaci-dərman və müalicə olanlara müraciət edir və çoxları ondan səhhət tapır.* T.Ş.Simurq. **Səhhəti-vücud!** – canın-başın sağ olsun! (Hamamdan çıxan adama səhhət arzusu bildirir). [Məşədi Qəzənfər:] *Məşədi İbad, səhhəti-vücud! Allah mübarək eləsin!* Ü.Hacıbəyov.

**SƏHİFƏ** *is.* [*ər.*] 1. Kitab, dəftər, qəzet və s. vərəqinin bir üzü. *Kitab 100 səhifədir. – Hər səhifədə hər gün; Neçə qələbə, zəfər; Neçə-neçə xoş xəbər...* R.Rza. // Kitabda, dəftərdə vərəq. *Kitabın birinci səhifəsi cırılmışdır. Səhifəni çevirmək. Əsərin üçüncü səhifəsində yazılmışdır.*

2. *məc.* Dövr, bir şeyin hissəsi. *Tarixə yeni səhifə açmaq.* – [Məsmə:] *Mənim həyatımın ikinci səhifəsi iyirmi üçüncü ilin baharından başlayır.* S.Hüseyn. *..Taqanroqu azad edən hissələr içərisində azərbaycanlılardan ibarət diviziya da öz döyüş şöhrəti ilə tarixin səhifələrinə imzasını atmışdı.* Ə.Məmmədxanlı.

**SƏHİFƏBAĞLAYAN** *is.* Mətbəədə yığılmış mətni (naboru) səhifələrə ayırıb düzən mətbəə işçisi; metranpaj.

**SƏHİFƏLƏMƏ** "Səhifələmək"dən *f.is.*

**SƏHİFƏLƏMƏK** *f.* 1. Kitabın, jurnalın, dəftərin və s.-nin səhifələrini bir-bir çevirmək, gözdən keçirmək. *Kitabı səhifələmək. Lüğəti səhifələmək.*

2. Mətbəədə yığılmış mətni səhifələrə ayırmaq, səhifə bağlamaq. *Kitabı səhifələmək. Qəzeti səhifələmək.*

3. Yazılı mətnin səhifələrini sıra ilə nömrələmək. *Məqaləni səhifələmək. Qrankaları səhifələmək.*

**SƏHİFƏLƏNMƏ** "Səhifələnmək"dən *f.is.*

**SƏHİFƏLƏNMƏK** "Səhifələmək"dən *məch.*

**SƏHİH** *sif.* [*ər.*] Düzgün, doğru, gerçək, əsaslı, yalan olmayan. *Səhih məlumat. Səhih söz. – Hələ indiyə qədər Araz qırağından səhih bir xəbər gəlməmişdi.* Çəmənzəminli. *Hamı Sərdarın dediklərini: – Doğrudur, səhih buyurursunuz, elədir, – deyə təsdiq etdi.* P.Makulu.

**SƏHİHLİK** *is.* Düzlük, doğruluq, düzgünlük, gerçəklik, əsaslılıq. *İşin səhihliyi aşkar oldu.*

**SƏHİYYƏ** *is.* [*ər.*] Əhalinin sağlamlığını qoruma, xəstəliklərin qabağını alma, onları müalicə etmə və ictimai təmizliyi saxlama. *Səhiyyə məntəqəsi. – Şirəli .. səhiyyə palatasına tərəf dırmanırdı.* M.Hüseyn. [Əsgər] *küçəaşağı səhiyyə şöbəsi yerləşən binaya tərəf yönəldi.* S.Rəhimov.

**SƏHL** *sif.* və *zərf* [*ər.*] *klas.* Asan iş. – *Sizcə şairlik, ədiblik, görünür, səhl işdir; Xeyr əfkarınız ol barədə çox yanlışdır.* A.Səhhət. *..Bəli, "papaq" məsələsini səhl saymaq olmaz.* C.Məmmədquluzadə.

**SƏHLƏB** *is.* [*ər.*] *bot.* Tərkibində selikli maddə və nişasta olan kökümsov gövdəli subtropik bitki və həmin bitkinin kökümsov meyvəsi. *Azərbaycanda bitən səhləb, .. gecəbənövşəsi və yabanı səhləb cinslərinin bütün növlərinin yeraltı kök yumruları səhləb adlanır.* M.Qasımov.

**SƏHLƏNKAR** *sif.* [*ər.* səhlən və *fars.* ...kar] Tapşırılan işə, vəzifəyə, tapşırığa laqeyd, soyuq baxan; diqqətsiz, qeydsiz, başı-

soyuq. *Səhlənkar adam. – Qızyetərin işi bilməsi və möhkəm durub səhlənkar traktorçu ilə sinə-sinəyə verməsi* [Rüstəmin] *xoşuna gəlmişdi*. M.İbrahimov. // İs. mənasında. *Əlbəttə, səhlənkarı məsuliyyətə almaq lazımdır*. S.Rəhimov.

**SƏHLƏNKARLIQ** *is.* İşə, tapşırığa, vəzifəyə soyuq baxma, laqeyd baxma; diqqətsizlik, başısoyuqluq. – *Guya Zeynal vəzifəsinə çox soyuq baxır, dəfələrlə özünə xatırladılmasına baxmayaraq səhlənkarlıqdan qalmırmış*. S.Hüseyn. [Baxış oğlu Həsən] *..bədəninin sağlamlığına çox səhlənkarlıqla* (z.) *baxardı*. B.Talıblı. ◻ **Səhlənkarlıq etmək** – tapşırılan işə yüngül münasibət bəsləmək, başısoyuqluq göstərmək. [Prokuror:] *Əlbəttə, vəzifədə səhlənkarlıq edənlər də məsuliyyət daşıyırlar*. İ.Şıxlı.

**SƏHM** *is.* [*ər.*] 1. Ayrı-ayrı müəssisənin işində və gəlirində iştirak etməyə hüquq verən pul payı; həmin pula bərabər qiymətli kağız.

2. Faiz, pay, hissə. [Məmmədxan] *kiçik bir nitqdən sonra qəsdən saldığı bu talanda özünün ən böyük səhm aparacağını eşitdirdi*. P.Makulu.

**SƏHMDAR** *is.* [*ər.* səhm və *fars.* ...dar] Ticarət, sənaye və ya maliyyə müəssisələrində payı və ya hissəsi olan şəxs, payçı. *Öncə səhmdarlar gəldi diz-dizə; Həpsi toxluğundan açdı ağzını*. M.Müşfiq. ◻ **Səhmdar(lar) cəmiyyəti** – səhm (pay) əsasında qurulan müəssisə, təşkilat.

**SƏHNƏ** *is.* [*ər.*] 1. Teatr tamaşalarının göstərildiyi xüsusi meydança. *Pərdə qalxdı, səhnə göründü. – Divanə gedir, bir neçə saniyədən sonra dəstə dəxi dağılıb, səhnədə bir Şah Abbas və bir də Məstavər öz dükanında qalır*. Ü.Hacıbəyov. *Səhnəyə təzə bir pianino qoyulmuşdu*. İ.Əfəndiyev. // Teatr fəaliyyəti, teatr. *Səhnə ustaları. – Kələntərli keçən ildə .. artistkalardan üçünün xəstələnib uzun müddət səhnədən aralandığını, repertuar planının pozulduğunu söylədi*. İ.Hüseynov. *Natiq indi bütünlüklə səhnəyə bağlanmışdı*. B.Bayramov.

2. Teatr tamaşasının ayrıca bir hissəsi, ayrıca bir parçası; şəkil, məclis. *Sonuncu səhnə daha maraqlıdır. – Əsər bədii cəhətdən nöqsansız deyildir. Müəyyən səhnələrdə əhvalat dramatizm və kəskin münaqişələrlə deyil, söhbət və təhkiyə yolu ilə verilir*. M.Arif.

3. Pyesdə, ədəbi əsərdə, şəkildə təsvir olunan ayrıca epizod. *Əsərdə dramatik səhnələr çoxdur. Romandan qəhrəmanın ölüm səhnəsini bir də oxumaq.*

4. Həyatda təsadüf edilə bilən hadisə, epizod, əhvalat. *Ölüm səhnəsi. Məhəbbət səhnəsi. – Bu qanlı səhnəyə heyran qalmayın; Mən öz gözlərimlə görürəm bunu.* S.Vurğun. *Alagöz öz daxili aləmi ilə bir cəzirə kimi yaşayan evdən qaçmış, həyatın faciəli səhnəsinə düşmüşdü.* S.Rəhimov.

5. *məc.* Fəaliyyət sahəsi (əsasən tərkib halında işlənir; məs.: tarix səhnəsinə çıxmaq, səhnədən getmək və s.). [Pəri Bəhrama:] *Özün məktəb görmüş cavansan, məhəbbət səhnəsində ülviyyət dolaşarmı?* C.Cabbarlı. *Bu plantasiya bir həyat səhnəsi idi.* H.Seyidbəyli.

**SƏHNƏCİK** *is.* 1. Səhnələşdirilmiş kiçik pyes, tamaşa. *Televizor ekranında C.Məmmədquluzadənin bir neçə hekayəsinin səhnəciyi göstərildi.* // Səhnə əsərindən bir hissə, bir parça. *Tamaşaçılar* "*Sevil*" *operasından bir səhnəciyə baxdılar.*

2. B a x **səhnə** 4-cü mənada. *Mən bu səhnəciyə inandım, gerçək; Var imiş həyatın xoş zamanları.* S.Vurğun.

**SƏHNƏLƏŞDİRİLMİŞ** *f.sif.* Səhnədə göstərilmək üçün uyğunlaşdırılmış, pyes şəklinə salınmış. *Səhnələşdirilmiş roman. Səhnələşdirilmiş hekayə.*

**SƏHNƏLƏŞDİRMƏ** "Səhnələşdirmək"-dən *f.is.*

**SƏHNƏLƏŞDİRMƏK** *f.* Hər hansı ədəbi əsəri teatrda və ya kinoda göstərmək üçün uyğunlaşdırmaq, pyes şəklinə salmaq. *M.F.Axundzadənin* "*Aldanmış kəvakib*" *əsərini səhnələşdirmək. M.İbrahimovun* "*Böyük dayaq*" *romanını ekran üçün səhnələşdirmək.*

**SƏHNƏLİK** *is.* Səhnə üçün yazılmış, səhnəyə yarar. *Səhnəlik əsər.*

**SƏHRA** *is.* [*ər.*] Susuz və bitkisiz geniş çöl; biyaban, düz. *Uzun aylarnan şəhərdə beynini yazı-pozu ilə yorandan sonra, birdən görürsən ki, səhranın ortasında, təmiz və saf havada, quşların və heyvanların içindəsən.*

C.Məmmədquluzadə. [Dərviş:] *Heyvanlar da tək-təkinə dolanmayıb, arxadaşlar ilə gəzdikləri halda mən öz həmcinsimdən ayrı düşüb ormanlarda, səhralarda qalmışdım*. A.Divanbəyoğlu.

◊ **Səhraya (səhralara) düşmək** – vətənindən, yurdundan ayrı düşmək. *Olubdu vətəndən avarə Zakir; Düşüb səhralara, dağlara Zakir.* **Səhraya salmaq** – vətənindən, yurdundan ayırmaq, avara-sərgərdan etmək.

**SƏHV** *is.* [*ər.*] Yazıda, hesablamada, müəyyən məsələnin həllində, işdə və s.-də yanlışlıq; nöqsan, xata. *İmla səhvi. Səhv hərəkət etmək. Səhv düşmək. – Demək, Nigar səhvini anlamış, başa düşmüşdür ki, ev kişisiz dolana bilməz.* S.Hüseyn. *Gəldiyev sinəsini irəli verdi, layihənin səhvini danışdı*. Mir Cəlal. ◻ **Səhv etmək (eləmək, buraxmaq)** – xataya, nöqsana yol vermək, yanılmaq, düzgün hərəkət etməmək. *Birinci dəfə səhv etmək. Səhv buraxdığına görə töhmət aldı. – Aç qabağına tarixin səhifələrini və əgər gördün ki, bir vaxt insanlar bir para işlərdə səhv eləyiblər, dəxi sən haman səhvi eləmə.* C.Məmmədquluzadə. [Süleyman:] *..Vallahi, çox böyük səhv eləmişəm, gərək bu qızı mən alaydım...* Ü.Hacıbəyov.

**SƏHVƏN** *zərf* [*ər.*] Səhv olaraq, yanılaraq, anlaşılmazlıq üzündən, yanlış olaraq, özü anlamadan, başa düşmədən. *Səhvən yol azmaq. Səhvən şeyləri yığmaq. Səhvən yada düşməmək. – Padşah, xəlifə ya zamanının ən böyük ruhanisi tərəqqi yolunu camaatın üzünə qəsdən, ya səhvən bağlayıbdır*. N.Nərimanov. *Hətta* [Gileygüzarov] *mənim adıma gələn məktubları* "*səhvən*" *açıb oxuyar, heç üzr də istəməz*. S.Rüstəm.

**SƏXAVƏT** *is.* [*ər.*] Əliaçıqlıq, comərdlik, genişürəklilik. [Vaqif:] *Ağa, ..iltifat və səxavətiniz aləmə bəllidir, amma zövqü, görünür, tək almaq istəyirsiniz...* Çəmənzəminli. [Mirzə:] *Ağanın şanı, şövkəti, calalı, dövləti, səxavəti o qədərdir ki, yazmaqla qurtarmaz.* Ə.Haqverdiyev. ◻ **Səxavət göstərmək** – əliaçıqlıq etmək, comərdlik göstərmək. [Məcnun Nofələ:] *Dostluğumuz xatirinə, səxavət göstərib* [ovçunu] *razı sal.* Ə.Məmmədxanlı.

**SƏXAVƏTLİ** *sif.* Səxavət edən; əliaçıq, şeyini, pulunu əsirgəməyən, comərd, genişürəkli, könlüaçıq. *Səxavətli adam. – Qaraca qız çox rəhmdil və səxavətli qız idi. Hər nə əlinə düşsəydi yoldaşları ilə bölüşərdi.* S.S.Axundov. *Bu səxavətli qonaqların hamısından artıq, nədənsə, Təbarəkin sovqatlarına fikir verilirdi*. Mir Cəlal.

**SƏKİ** *is.* 1. Piyadaların gediş-gəlişi üçün küçənin hər iki tərəfində asfalt, daş, taxta və s. döşənmiş və adətən küçədən bir qədər hündür yol. *Səki ilə getmək. Səkiyə çıxmaq. Səkidə üz-üzə gəlmək. – Faytonlar daş döşəməli bir səkinin ağzında durdular..* M.İbrahimov. *Çobanlar ağır addımlarla kəndin orta küçəsi ilə uzaqlaşıb gedir, səkidə dirəyə söykənib dayanmış Qumru isə onların başı üstündən hara isə uzaqlara baxırdı*. Ə.Məmmədxanlı.

2. Oturmaq üçün həyətdə, hamamda, qapı ağzında və s.-də düzəldilmiş hündür yer. *Şeyləri səkiyə yığmaq*. – [Qadınlar] *hər halda günəş istiliyini duymayırdılar, çadralarına bürünüb qır səki üzərində oturmuş və gözlərini məhkəmə qapısına dikmişdilər*. T.Ş.Simurq. *Bu, qaya içində salınmış, qabağında kiçik daş səkisi olan, torpaq damlı, kiçikcə pəncərəli, bir qapıcığazlı daxma idi.* Ə.Əbülhəsən.

**SƏKİL** *sif.* Ayaqları qismən və ya bütünlüklə ağ rəngdə olan. *Səkil dayça. Səkil qoyun. – Xosrov səkil atın belində bir qartal kimi qanadlanardı*. S.Rəhimov. *Bəy* [atın] *kəkilini sığalladı, səkil ayaqlarının tozunu təmizlədi.* M.Hüseyn.

**SƏKİLİ** *sif.* Səkisi olan, səki tikilmiş. *Səkili hamam. Səkili küçə. – Bütün kənd .. tək bacalı qara damlarda, ya da ömründə gün üzü görməyən qabağı səkili tövlələrdə yaşayırdı.* S.Rəhimov.

**SƏKİLLİ** *sif.* Ayağı səkil olan. *Səkilli at. Səkilli qoyun*. – [İlyas Adiləyə:] "*Tərlan*" *səkilli sol biləyini qaldırıb dırnağı ilə yeri döyəcləyir.* Ə.Məmmədxanlı.

**SƏKKİZ** *miqd. s*. Yeddidən sonra gələn ədəd – 8. *Səkkiz kitab. Səkkiz ay. Səkkiz saat. Səkkiz döyüşçü.* – [Əşrəf] *cəmi səkkiz deşiyi olan adi, nazik mis tütəyi dodaqlarına yaxınlaşdırıb çalan adamı gözlərinin qarşısında canlandırmağa çalışdı.* İ.Şıxlı.

**SƏKKİZADAMLIQ** *sif.* Səkkiz adam üçün ayrılan, səkkiz adam üçün olan; səkkiznəfərlik. *Səkkizadamlıq yer tutmaq.*

**SƏKKİZAYLIQ** *sif.* 1. Səkkiz ay davam edən və ya davam etmiş, səkkiz ay üçün düzəldilmiş, səkkiz aylıq müddət nəzərdə tutulmuş. *Səkkizaylıq məlumat.*

2. Yaşı səkkiz ay olan. *Səkkizaylıq uşaq.*

**SƏKKİZBUCAQ** *is. hənd.* Səkkiz bucağı olan cisim, səkkizbucaqlı cisim.

**SƏKKİZBUCAQLI** *sif.* Səkkiz bucağı olan. *Səkkizbucaqlı fiqur. – Zahirən Mahmudun dükanı səkkizbucaqlı bir qutuya bənzəyirdi ki, içində saqqız, tumanbağı .. tapmaq mümkün idi.* B.Talıblı.

**SƏKKİZCƏ** *sif.* Ancaq səkkiz, yalnız səkkiz. *Səkkizcə kitabım var.* // Bəzən təyin etdiyi sözə böyüdücülük mənası verir. *Səkkizcə manat pul vermişəm.*

**SƏKKİZCİLDLİ** *sif.* Səkkiz cilddən ibarət olan. *Səkkizcildli lüğət.*

**SƏKKİZCİLDLİK** 1. Bax **səkkizcildli**.

2. *is.* Səkkiz cilddən ibarət kitab.

**SƏKKİZDÜYMƏ** *sif. dan.* Ölçüsü səkkiz düymə olan.

**SƏKKİZGUŞƏ(Lİ)** bax **səkkizbucaqlı**. *Ağca uca taxtbəndli tavan altındakı hər bir otağın ortasındakı səkkizguşəli üç pilləli ataş nəhrinə gəldi.* Ə.Məmmədxanlı. *Səkkizguşə ulduzumda səkkiz cənnət qapısı var; Yalnız oğul qeyrətilə açılacaq bu qapılar.* X.Rza.

**SƏKKİZGÜNLÜK** *sif.* Səkkiz gün sürmüş və ya sürən, səkkiz gün üçün nəzərdə tutulmuş. *Səkkizgünlük səyahət. Səkkiz günlük iş.*

**SƏKKİZHECALI** *sif. dilç.* Səkkiz hecası olan. *Səkkizhecalı söz.*

**SƏKKİZHƏDLİ** *is. riyaz.* Səkkiz həddən ibarət olan cəbri ifadə.

**SƏKKİZİLLİK** *sif.* 1. Səkkiz il sürən, səkkiz il müddətli, səkkiz il davam edən. *Səkkizillik dövr.* – [Xınalıq kəndinin] *səkkizillik məktəbində 260 şagird oxuyur.* R.Rza.

2. Səkkiz yaşında olan.

3. Səkkiz ildən qalma, səkkiz il ömrü olan. *Səkkizillik sirkə. Səkkizillik konyak.*

**SƏKKİZİNCİ** "Səkkiz"dən sıra sayı. *Səkkizinci sinif. Səkkizinci mərtəbə. Səkkizinci sıra.* – [Musa] *səkkizinci günü Kür çayına yaxın "İ" kəndində Gülaranın və uşağının meyitinin tapılıb basdırıldığı xəbərini aldı.* Ə.Vəliyev.

**SƏKKİZKÜNC(LÜ)** bax **səkkizbucaqlı**. [Çobanlar bulamanı] *səkkizkünc qalın stəkanlara doldurub qoca çobana, Qoşatxana və Kərəmə təklif etdilər.* M.İbrahimov.

**SƏKKİZQAT(LI)** *sif.* 1. Səkkiz mərtəbə(li). *Səkkizqatlı bina.*

2. Bir-birinin üzərində səkkiz lay olan. *Səkkizqatlı karton.*

**SƏKKİZLİK** 1. *sif.* Ölçüsü (eni, hündürlüyü, qalınlığı) səkkiz düymə (və s.) olan. *Səkkizlik taxta. Səkkizlik mismar.*

2. *is.* Oyun kağızlarında səkkiz xalı olan vərəq, yaxud səkkiz nömrəli şey. *Səkkizlik kart.*

3. Səkkiz hecalı şeir ölçüsü.

**SƏKKİZMƏRTƏBƏ(Lİ)** *sif.* Səkkiz mərtəbəsi olan; səkkizqatlı. *Səkkizmərtəbəli bina.*

**SƏKKİZNƏFƏRLİK** bax **səkkizadamlıq**.

**SƏKKİZOTAQ(LI)** *sif.* Səkkiz otağı olan, səkkiz otaqdan ibarət olan. *Səkkizotaqlı ev. – İkimərtəbə səkkizotaq, böyük bir samanlıq, iri bir pəyə, aşpazxana, uzun bir anbar, çardaq – hamısı alov içində idi.* Ə.Vəliyev.

**SƏKKİZRƏQƏMLİ** *sif.* Səkkiz rəqəmi olan, səkkiz rəqəmdən ibarət.

**SƏKKİZSAATLIQ** *sif.* Səkkiz saat sürmüş və ya sürən; səkkiz saat vaxt tələb edən. *Səkkizsaatlıq iş günü.*

**SƏKKİZSÜTUNLU** *sif.* Səkkiz sütunu olan. *Səkkizsütunlu salon.*

**SƏKKİZTARLALI** *sif. k.t.* Səkkiz ildən bir dövr edən (əkin dəyişmə). *Səkkiztarlalı əkin.*

**SƏKKİZÜZLÜ** *is.* Səkkiz üzü olan həndəsi cisim.

**SƏKKİZYAŞAR** *sif.* Səkkiz yaşında olan, səkkizyaşlı. *Səkkizyaşar uşaq.*

**SƏKKİZYAŞLI** *sif.* Yaşı səkkiz olan. *Səkkizyaşlı uşaq.*

**SƏKMƏ** "Səkmək"dən *f.is.*

**SƏKMƏK** *f.* Bir və ya hər iki ayaq üstündə sıçrayaraq yerimək, sıçramaq, hoppanmaq. *Kəhər at səkərək qonşu evin həyətində göründü və bir göz qırpımında .. Cəmilin qarşısında dayandı.* M.Hüseyn. *Çayın o tayındakı düzəngahda kəhər ürkə səkməyə başladı.* Ə.Vəliyev. // Bu qaydada uçmaq, yaxud yerimək. *Uçuşur durnalar, səkir teyhular; Namərd*

*adam qalibliyin arzular.* Qurbani. *Qayalarda kəklik səkir; Bulud qalxır, yağış tökür.* Aşıq Şəmşir. // Məc. mənada. [Püstəbanu bəyim:] *Zalım oğlunun gərdəni bir qarışdır. Yerişinə bax!.. Səkir...* N.Vəzirov. *Səkdi gəlin, süzdü gəlin, bir də məclisin ortasında duruxub, əlləri ilə üzünü qapadı, gəlin hönkürürdü.* Çəmənzəminli.

◊ **Quş da səkə bilməz (səkməsin)** – cürət edib yanından ötə bilməz. *– Bir quş da səkməsin onun yanından! – Baş üstə yatmaram gecəni bir an.* S.Vurğun. [Ataş Mirzə Cəmilə:] *Nə qədər ki Ataş sağdır, Qönçənin həndəvərinə quş da səkə bilməz.* Ə.Vəliyev. **Quş səkməz (səkməyən) yer** – qorxulu, uçurum, insan ayağı dəyməyən yer haqqında. [Sübhanverdizadənin] *yolu dibsiz dərələrin yaxası ilə bitişən dağların sıldırım döşü, quş səkməyən yeri ilə gedir.* S.Rəhimov. [Qəhrəman:] *On il bundan əvvəl quşlar belə qorxusundan səkə bilmədiyi meşələr indi necə azaddır.* Ə.Vəliyev.

**SƏKSƏKƏ, SƏKSƏKİ** *is.* Həyəcan, iztirab, təşviş, təlaş, narahatlıq. [Şəhrəbanu xanım:] *Xanpəri, mən də onun cadusunun gücünü eşitmişəm. Amma genə bir az səksəkiyəm, etdiyi işlərdən heç bilirsənmi?* M.F.Axundzadə. *Sayad bacının ana ürəyi həmişə səksəkədə idi.* M.Hüseyn. *Ürəklərdə səksəkə; Baxışlarda intizar, İnsanlar axın-axın; Salona toplaşırlar.* R.Rza.

◊ **Səksəkə içərisində olmaq, ürəyi səksəkədə olmaq** – narahatlıq keçirmək, həyəcan içərisində olmaq, iztirab keçirmək. *Mindilli səksəkə içərisində, o yan-bu yana baxa-baxa içəri keçir.* S.Rəhman.

**SƏKSƏKƏLİ, SƏKSƏKİLİ** *sif.* və *zərf* Həyəcanlı, iztirablı, narahat. *Nə olub? – deyə, ürəyi səksəkəli rəiyyət bir-birinə dəydi.* S.Rəhimov. *Yolçular səksəkəli; Zirvələrə baxdılar; Qayadan bir daş uçdu.* N.Xəzri. *Ürəyi səksəkəli olan yasavulbaşı onu narahat etdikləri üçün hirslənmək istədisə də bacarmadı.* M.Rzaquluzadə.

**SƏKSƏN** *say.* Yetmiş doqquzdan sonra gələn rəqəm – 80; həştad. *Səksən manat. Səksən ədəd. Səksən adam.*

**SƏKSƏNDİRMƏ** "Səksəndirmək"dən *f.is.*

**SƏKSƏNDİRMƏK** b a x **diksindirmək**. *Qapıya vurulan təkan Həcəri səksəndirdi.* S.Rəhimov. *Mahmud hirslə "cəhənnəmə ki!" – deyərkən ürkəni səksəndirdi.* M.Hüseyn.

**SƏKSƏNİLLİK** 1. *is.* Səksən il davam etmiş dövr, ömür. *Şairin səksənilliyi.*

2. *Sif. mənasında.* Səksən il davam etmiş, səksən il sürmüş. *Səksənillik bir ömür.*

**SƏKSƏNİNCİ** "Səksən"dən sıra sayı. *Səksəninci qapı. Səksəninci nömrə. Səksəninci illər.*

**SƏKSƏNLİK** *sif.* Səksən yaşında. *Səksənlik qoca.*

**SƏKSƏNMƏ** "Səksənmək"dən *f.is.*

**SƏKSƏNMƏK** b a x **diksinmək** 1 və 2-ci mənalarda. *Sultan bəy səksənib dayanır.* Ü.Hacıbəyov. *Üzü o tərəfə dayanmış katib səksənib, çiyni üzərindən geri boylandı.* M.Hüseyn.

**SƏKSƏNYAŞLI** *sif.* Səksən yaşında olan. *Səksənyaşlı qoca.*

**SƏKTƏ** *is.* [*ər.*] *köhn.* 1. Durğunluq, bir yerdə dayanıb qalma.

2. Zərər, xələl, ziyan.

3. Qan dövranının, ürəyin birdən-birə fəaliyyətdən düşməsi, hərəkətinin dayanması.

**SƏQF** *is.* [*ər.*] Tavan, bağdatı. *Alçaq səqfdən asılan otuzluq "molniya" lampası böyük otağı işıqlandırırdı.* T.Ş.Simurq. *Mən onları çətin vəziyyətdən çıxarmaq üçün gözümü səqfə dirəyib soruşdum.* S.Rəhman.

**SƏQQA** *is.* [*ər.*] *köhn.* Keçmişdə evlərə su daşıyan; su paylayan, suçu. *Təbrizin məşhur səqqalərindən Tacı qızı Züleyxanın qapısını vururlar.* M.S.Ordubadi.

**SƏLAHİYYƏT** *is.* [*ər.*] Vəzifəsinə görə bir işə qarışmağa, bir işi görməyə ixtiyarı, hüququ olma. [Səba:] *Bilmirəm, ağanın gətirdiyi bu qədər zəngin bir hədiyyəni qəbul etməyə səlahiyyətim vardırmı?* M.S.Ordubadi. *Mehriban, Zeynalın öz üzərində bir "ər" olmaq sifətilə haqq və səlahiyyətini düşünürdü.* S.Hüseyn. // Birinin ixtiyarı, hüququ dairəsində olan məsələlər, işlər. *Məhkəmənin səlahiyyəti. Bu, mənim səlahiyyətimə daxil deyil.*

□ **Səlahiyyət vermək** – ixtiyar vermək, hüquq vermək. [Xan] *yerində qoyduğu Ağası bəyə xanlıqda asayişi təmin etmək üçün böyük səlahiyyət verdi.* Çəmənzəminli.

**SƏLAHİYYƏTDAR** [*ər.* səlahiyyət və *fars.* ...dar] *rəs. köhn.* b a x **səlahiyyətli**. *O, peşəkarı hesab olunan Nizamülmülkün də işlərinə qarışmağa səlahiyyətdar deyildir.* M.S.Ordubadi.

**SƏLAHİYYƏTLİ** *sif.* Səlahiyyət verilmiş, hər hansı bir səlahiyyəti, hüququ olan. *Səlahiyyətli səfir.*

**SƏLBƏ** *is.* 1. Ağacdan meyvəni salmaq, heyvanları qovmaq və s. üçün atılan ağac parçası. [İmamverdi:] *Ağız, ..o nədir tolazlamısan səlbəni, gedib dəyib Haykanuşun danasının gözünə, o da gəlmişdi Allahverdi kişinin üstünə davaya.* C.Cabbarlı.

2. Səlbə kimi tullanılan, atılan hər hansı bir şey. *Dəmir səlbəsi. Papaq səlbəsi.* – [Şaqqulu] *da əlini rəfə atıb, "köpək oğlu özünsən!" – deyib kərbəlayıya bir qazan səlbəsi vurdu..* Çəmənzəminli.

**SƏLBƏLƏMƏ** "Səlbələmək"dən *f.is.*

**SƏLBƏLƏMƏK** *f.* Səlbə vurmaq, səlbə atmaq. *Ağacı səlbələmək. Heyvanları səlbələmək.*

**SƏLCUQLAR** *cəm* XI əsrin ortalarında Kiçik Asiya ərazisində, İran və İraqda böyük dövlət qurmuş köçəri türkmən qəbilələri.

**SƏLDİRƏMƏ** "Səldirəmək"dən *f.is.*

**SƏLDİRƏMƏK** b a x **səldirləmək**. *Faytonçu müvazinətini saxlaya bilməyib səldirədi, iki addımlıqdakı qaramıx kolunun üstünə yıxıldı, kürəyinə tikan doldu.* M.Hüseyn. *..Onsuz da ayaq üstündə güclə duran qarı, böyrünə toxunan qolların təsirindən səldirədi.* İ.Hüseynov.

**SƏLDİRLƏMƏ** "Səldirləmək"dən *f.is.*

**SƏLDİRLƏMƏK** *f.* Yıxılan kimi olub yerişini çaşdırmaq, ləngər vuraraq yerimək; səndələmək. *Sərxoş səldirlədi. – Tərlan səldirləyə-səldirləyə* (z.) *paltarını geyib qapıya yanaşdı.* M.Hüseyn.

**SƏLƏ** *is.* Küpə və s. qabların ağzını bağlamaq üçün kənd yerlərində işlədilən, kəsilmiş heyvan qarnının təmizlənmiş bir parçası. *Qız durdu ayağa, getdi, küpənin sələyin açdı.* (Nağıl).

**SƏLƏF** *is.* [*ər.*] Hər hansı bir sahədə, işdə, mövqedə fəaliyyəti o birindən daha qabaq olmuş, yaxud qabaq yaşamış adam (*xələf* ziddi). *Sələflərə dərin hörmət. – Bizim emblemamız, rəmzimiz, şərəfimiz; Qoy olsun sələf, – dedik.* B.Vahabzadə.

**SƏLƏM** [*ər.*] b a x **müamilə** 3-cü mənada. *Əmi qeyri adamlara da sələmlə pul verərdi.* N.Nərimanov. *Dadaş atlı gedir aşağı kəndə; Gedir kəndliləri salmağa bəndə; Gedir verilməyən sələm dalınca.* M.Müşfiq.

**SƏLƏMÇİ** b a x **müamiləçi**. [Veys:] *Şura hökuməti qoymayacaq ki, sən* [Allahqulu] *tacir, sələmçi Hacı Tağını itələyib oturasan onun yerində.* Ə.Əbülhəsən.

**SƏLƏMÇİLİK** b a x **müamiləçilik**.

**SƏLƏMXOR** [*ər.* sələm və *fars.* ...xor] b a x **müamiləçi**. *Alo tərs baxışla sələmxor Məşədi Qulamı süzüb, əlavə etdi..* S.Rəhimov.

**SƏLİB** *is.* [*ər.*] Xaç. *Bir çoxlarının başlarındakı səlib qırılmış, bir qisimləri yanı üstə yerə yıxılmışdı.* S.Hüseyn. ◻ **Əhlü-səlib** *tar.* – b a x **səlibçi**.

◊ **Səlib müharibələri** *tar.* – katolik kilsəsinin təşəbbüsü ilə dinsizlərlə mübarizə şüarı altında XI-XIII əsrlərdə Qərbi Avropa feodallarının Yaxın Şərq və Pribaltika əhalisinə, habelə Şərqi Avropa slavyanlarına qarşı apardıqları işğalçılıq yürüşləri.

**SƏLİBÇİ** *is. tar.* Səlib müharibəsi iştirakçısı.

**SƏLİQƏ** *is.* [*ər.*] Nizam və qayda, bir şeyin düzgün vəziyyəti, nizamda olması. *Səliqəyə salmaq. Şeyləri səliqə ilə düzmək. Kitabları səliqədə saxlamaq. – Evin səliqəsində heç bir dəyişiklik yox idi.* M.Hüseyn. *Qədir kişi Fərmanın evinin səliqəsini çox bəyəndi.* Ə.Sadıq. // Bir şeyi nizam və qaydada, gözəl vəziyyətdə saxlama və ya işləmə qabiliyyəti. *Onun səliqəsinə söz yoxdur.* ◻ **Səliqə ilə** – b a x **səliqəli** 1 və 3-cü mənalarda. *Oğlan çox səliqə ilə geyinmişdi.* İ.Əfəndiyev. *Cahangirovun seyrək ağ saçları səliqə ilə dala daranmışdı.* S.Qədirzadə.

**SƏLİQƏLİ** *sif.* 1. Səliqəyə, üsula müvafiq, səliqəyə salınmış, müntəzəm, düzgün, nizamlı. *Səliqəli iş otağı. Səliqəli yataqxana. Səliqəli ev.* – [Hakim] *səliqəli stolunun üstündə gördüyü lazımsız kağızları bir-bir cırıb səbətə atırdı ki, əl-ayağa dolaşmasın!* Mir Cəlal. // Hər şey öz yerində, qaydada. *Balaca həyət yenə əvvəlki kimi səliqəli idi.*

2. Səliqəsi olan, işi səliqə ilə görən, səliqə qaydalarını gözləyən. *Səliqəli qız. Səliqəli şagird. – Səliqəli maldarlar axşam vaxtı çöldən naxır qayıdan zaman oğul-uşağı düzərlər qapılara ki, camışlar, öküzlər, inək və danalar düz girsinlər töylə həyatinə.* C.Məmmədquluzadə.

3. *Zərf mənasında.* Təmiz, diqqətli, dürüst, hər şey öz yerində. *Skamyada mənimlə birlikdə səliqəli geyinmiş cavan bir gürcü də oturmuşdu.* A.Şaiq. *Şagirdlərdən, əyinlərinə geydikləri formanın son dərəcə səliqəli olmasını, düymələrinin, papaqlarındakı ulduzun par-par parıldamasını tələb edirdilər.* Ə.Sadıq.

**SƏLİQƏ(Lİ)LİK** *is.* Səliqəli olma, hər şeydə səliqə, qayda gözləmə; dürüstlük, dəqiqlik. *Səliqəliliyə alışmaq.* – [Əntərzadə] *nəinki səliqəlik məharətini, hətta başını da itirdi.* Mir Cəlal.

**SƏLİQƏ-SAHMAN** *is.* [*ər.*] b a x **səliqə**. *Səliqə-sahman yaratmaq. Səliqə-sahmanı gözləmək. Səliqə-sahmanı pozmaq. – Səliqə-sahman yaxşı şeydir axı.* Mir Cəlal. *Aran yerlərindən gəlmiş adamlar öz səliqə-sahmanı, geyim-kecimi ilə dərhal fərqlənirdilər.* B.Bayramov.

**SƏLİQƏ-SAHMANLI** *sif.* Son dərəcə səliqəli, diqqətli, nizamlı. *Səliqə-sahmanlı qadın.*

**SƏLİQƏSİZ** *sif.* Səliqə olmayan, qaydasız, nizamsız, tərtibsiz. *Səliqəsiz yeməkxana. Səliqəsiz iş.* // Səliqəsi olmayan, səliqə bilməyən. *Səliqəsiz adam.*

**SƏLİQƏSİZLİK** *is.* Səliqə, nizam və qaydanın olmadığı hal; nizamsızlıq, pozğunluq. *İşdə səliqəsizlik. Evdə səliqəsizlik. – Müdirin otağındakı səliqəsizlik, narazı rəftar və danışığı işə can yandırmadığını göstərirdi.* M.İbrahimov.

**SƏLİS** *sif.* [*ər.*] Rəvan, sərbəst, axıcı, hər cəhətdən mükəmməl. *Səlis şeir. Səlis nitq. Səlis süjet. – Bir baxın, ana dilimizdə yazılan şeir nə qədər mövzun, nə qədər səlis, nə qədər də oynaq və bədiidir.* M.S.Ordubadi. *Bütün müdərrislərimiz ondakı səlis, axıcı natiqliyə qibtə edirdilər.* İ.Əfəndiyev.

**SƏLİSLİK** *is.* Rəvanlıq, axıcılıq. *Nitqin səlisliyi. Məqalə səlisliyi ilə fərqlənir. Yazıda ardıcıllığı, səlisliyi gözləmək.*

**SƏLSƏLƏ** *is.* [*ər.*] Göyərçinə bənzər böyük quş.

**SƏLT** *sif. dan.* Bütünlüklə, başdan-ayağa, tamamilə, lap. *Xörək səlt yağdır. Çörək səlt duzdur.*

**SƏLTƏNƏT** *is.* [*ər.*] 1. Padşahlıq, hökmdarlıq. *Səltənətə keçmək. Səltənət əlindən çıxmaq. Səltənət sürmək. – ..İbrahim xan Qarabağa qayıdanda qardaşı Mehralı bəylə arasında səltənət davası düşmüşdü.* Çəmənzəminli. *Həddindən artıq təkəbbürlü və lovğa olan şah səltənət adamlarının tələbinə görə özünü daha da təkəbbürlü və qaşqabaqlı göstərməyə çalışırdı.* P.Makulu.

2. Dövlət, hökumət. [Müsyö Jordan:] *Parij dağılıb, Tülyeri yıxılıb, Fransanın səltənəti pozulub, Kral avara düşüb.* M.F.Axundzadə. *Toğrulun təzədən səltənət başına gətirilməsi üçün xəlifənin də razılığı alınmışdır.* M.S.Ordubadi. // *məc.* Var, dövlət, yaxud ən əziz, ən qiymətli şey, adam haqqında. [Araz:] *Sağlamlıq və zəhmət ən böyük səltənətdir.* A.Şaiq. *Gözümün qarası, ciyərimin parası, taxtım, bəxtim, səltənətim, taci-sərim, qönçə gülüm, bülbülüm Ruqiyyə idi, Ruqiyyə.* A.Divanbəyoğlu.

3. *məc.* Obrazlı təşbehlərdə: bir şeyin hakim, hökmran, çox bol olduğu yer haqqında. *Neft səltənəti. İşıq səltənəti. – Qarşımıza daha böyük bir dağ çıxdı. Bu dağı da aşdıq; çiçəklər səltənəti deyilməyə layiq bir açıqlığa çıxdıq.* A.Şaiq. *Nə sonsuzdur bu yerlərdə səltənəti qarın, buzun!* R.Rza.

**SƏMA** *is.* [*ər.*] Göy, asiman. *Yaz mövsümü endikcə səmadan yerə axşam; Gün nuru verir dağlara min rəngi-dilaram.* A.Səhhət. *Bu gün heç bilmirəm, nə üçün, nədən; Səma da mavidir; Torpaq da mavi.* N.Xəzri. *Gündoğan tərəf utancaq bir qız yanağı kimi qızarır, ..səma ağır-ağır dalğalanan bir sədəf gölü kimi hər an rəngdən-rəngə girirdi.* M.Rzaquluzadə.

**SƏMAVİ** *sif.* [*ər.*] 1. Səmaya, göyə mənsub.

2. *şair.* Səma rəngində, mavi. *Allah, Allah! Nə qədər ülvi... O mavi gözlər. O səmavi gözlər.* H.Cavid. *Səmavi tüllərdən əynində köynək; Füsunkar bir gəlin oturmuşdu tək.* M.Dilbazi.

3. *məc. şair*. Gözəl, təmiz, saf, valehedici, qeyri-adi. *Səmavi alnının uc tellərində; Ülkər tək parlayıb axan, a gözlər!* A.Şaiq. *O səmavi pərinin; Qəlbi intizardadır*. N.Rəfibəyli.

**SƏMAYİ-ŞƏMS** *is.* [*ər.*] *mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *Səmayi-şəms oxumaq*.

**SƏMƏ** *sif.* Ağıldan kəm, ağlı çatmayan.

**SƏMƏND** *sif.* Qızılı ilə boz rənglər arasında xüsusi bir rəngdə olan (at haqqında).

**SƏMƏNDƏR** *is.* [*fars.*] 1. İran əsatirində: odda yaşayan mövhumi bir heyvanın adı. *Qaldım səməndərtək qəm dəryasında; Yandı balü-pərim nara dəyməmiş.* Aşıq Ələsgər. *Od-alov quşudur səməndər quşu; O nə göy quşudur, nə də yer quşu.* B.Vahabzadə.

2. *zool.* Həm suda, həm də quruda yaşayan kərtənkələyə oxşar heyvan.

**SƏMƏNİ** *is. etnoqr*. 1. Novruz bayramında boşqablarda göyərdilən buğda. *Süfrənin ortasında ara-sıra boşqablarda yaşıl səməni qoyardılar.* H.Sarabski. [Sultan və Vəli] *bu bənövşə dəstələrini novruz-bayramı münasibətilə məcməyilərdə göyərdilmiş səmənilərin ortasına qoyacaqlar*. Ə.Sadıq. ☐ **Səməni qoymaq** – xalq adətincə Novruz bayramı münasibətilə boşqablarda buğda göyərtmək. *Səməni də qoydu gəlin bayramqabağı; Pal-paltarı, qab-qacağı çəkdikcə suya.* S.Vurğun. *Günəş öpdü çəməni; Evdə qoyduq səməni*. M.Dilbazi.

2. Göyərmiş buğda, şirəsindən bişirilən bir növ halva. *Bəzi yerlərdə insana bir xəta üz verəndə nəzir elərlər və haman xəta rədd olandan sonra səməni qonşulara paylarlar.* "Mol. Nəsr."

**SƏMƏR** [*ər.*] b a x **səmərə**. *De görüm, onların nədir səməri? Bəlkə də hər kəsə çatır zərəri!* M.Ə.Sabir. *Belə acı sözlər təzə qəzetənin müştərilərini azaldıb və onu oxuyanları şövq və həvəsdən salmaqdan özgə bir səmər verməz*. F.Köçərli.

**SƏMƏRƏ** *is.* [*ər.*] 1. Fayda, mənfəət, xeyir. *Əməyin səmərəsi.* – [Odabaşı:] *Neçə gün ciddi axtarış getdisə də, bir səmərə hasil olmadı*. Ə.Haqverdiyev. [Kərimxan Azadidə] *öz zəhmətinin səmərəsini görən bir yaradıcı sevinci vardı.* M.İbrahimov.

2. Hər hansı işdən doğan yaxşı və ya pis nəticə. [Qurbanəli:] *İndi, budur, səmərəsini öz gözünüz ilə görürsünüz*. H.Nəzərli. *Əgər indi toxumlar yer üzərində qalsa, onlar tuluqlayıb donacaq, heç bir səmərəsi olmayacaq və fayda verməyəcəkdi*. S.Rəhimov.

**SƏMƏRƏLƏŞDİRİCİ** *is.* İstehsalatı, istehsal proseslərini səmərələşdirmək işi ilə məşğul olan adam. // Sif. mənasında. *Səmərələşdirici fəhlə. Səmərələşdirici tokar. Səmərələşdirici təklif.*

**SƏMƏRƏLƏŞDİRİLMƏ** "Səmərələşdirilmək"dən *f.is.*

**SƏMƏRƏLƏŞDİRİLMƏK** *məch.* Səmərəli hala salınmaq, daha məqsədəuyğun şəkildə təşkil edilmək; təkmilləşdirilmək, yaxşılaşdırılmaq.

**SƏMƏRƏLƏŞDİRMƏ** 1. "Səmərələşdirmək"dən *f.is.*

2. B a x **səmərələşdirici**. *Səmərələşdirmə bürosu. Səmərələşdirmə tədbirləri.*

**SƏMƏRƏLƏŞDİRMƏK** *f.* Səmərələşdirmə işləri aparmaq. *Maşın detalları hazırlamaq prosesini səmərələşdirmək. İstehsalatı səmərələşdirmək.*

**SƏMƏRƏLİ** *sif.* Səmərə verən, yaxşı nəticə verən, faydalı, xeyirli, məqsədəuyğun, əlverişli. *Səmərəli təklif. Səmərəli istirahət. Texnikadan səmərəli* (z.) *istifadə etmək.*

**SƏMƏRƏSİZ** *sif.* və *zərf* Heç bir səmərəsi, faydası, nəticəsi olmayan, məqsədəuyğun olmayan, faydasız, xeyirsiz. *Kosa gah koridora daxil olur, gah balkona çıxıb gəzirdi. Onun əziyyətləri səmərəsiz qalırdı*. S.Rəhimov. *Şirzad bilirdi ki, yazda səmərəsiz keçən hər saat, yaxud vaxtında görülməyən ən xırda iş tonlarla məhsulun itməsi deməkdir*. M.İbrahimov.

**SƏMƏRƏSİZLİK** *is.* Səmərəsiz olma, faydasızlıq, nəticəsizlik.

**SƏMİMİ** *sif.* [*ər.*] Ürəkdən gələn; dəruni, həqiqi, xalis, ciddi, riyasız. *Səmimi söz. Səmimi dostluq. – O, çox mehriban, səmimi bir təbəssümlə gülümsündü*. M.Rzaquluzadə. // Həqiqi, doğru, ən yaxın, qəlbən bağlı. *Səmimi dost. Səmimi adam. – Xədicə ilə yalnız barışmaqla qalmayıb səmimi bir arqadaş olduq.* S.Hüseyn. *Bu dəqiqə* [Xasay] *bayaqdan bəri daldığı şirin düşüncələrdən, səmimi*

*cəbhə yoldaşlarından aralanmaq istəmirdi.* Ə.Vəliyev. // *Zərf mənasında.* Təmiz ürəklə, candan, qəlbən. *Səmimi qarşılamaq. Səmimi danışmaq.*

**SƏMİMİ-QƏLBDƏN** *zərf* Ürəkdən, qəlbən. *Səmimi-qəlbdən təşəkkür etmək. Səmimi-qəlbdən təbrik etmək.*

**SƏMİMİLƏŞMƏ** "Səmimiləşmək"dən *f.is.*

**SƏMİMİLƏŞMƏK** *f.* Bir-birinə daha da yaxın olmaq, səmimi olmaq, mehribanlaşmaq. [Hüseyn:] *Qızla yenə yolumuza başladıq. Bu dəfə müsahibəmiz bir qədər daha səmimiləşmişdi.* S.Hüseyn.

**SƏMİMİLİK** bax **səmimiyyət** 1-ci mənada. [Daşdəmirin] *gözlərində və sözlərində elə bir sadəlik və səmimilik vardı ki, bu, dinləyənlərə də sirayət edirdi.* M.Rzaquluzadə. *Çiçək Ümidin danışığına, sifətindəki uşaqlıq və səmimilik əlamətlərinə diqqət elədi.* B.Bayramov.

**SƏMİMİYYƏT** *is.* [*ər.*] 1. Səmimilik, açıqürəklilik; səmimi münasibət. *Ailədəki səmimiyyət. Səmimiyyət göstərmək. – Bu nəğmələr dərin-dərin; Geniş-geniş ürəklərin; Səmimiyyət nəğməsidir.* M.Müşfiq. *Oğlanın sözlərindəki səmimiyyəti hiss edən Məşədibəy bir qədər arxayınlaşıb sükuta qərq oldu.* M.Hüseyn.

2. **Səmimiyyətlə** şəklində *zərf* – səmimi olaraq, səmimi; açıq ürəklə, saf qəlblə. *Səmimiyyətlə cavab vermək.* – [Mansur] *..hər dəfə əlimi əlinə aldıqda səmimiyyətlə sıxardı.* Çəmənzəminli. *Məmmədov böyük bir səmimiyyətlə arvadın əlini sıxdı.* H.Seyidbəyli.

**SƏMİR** *is.* [*ər.*] Səs, səs-səmir.

**SƏMİRMƏK** *f. məh.* Kökəlmək, gombullaşmaq.

**SƏMİZMƏK** *f. məh.* Yağlanmaq, piylənmək.

**SƏMT** *is.* [*ər.*] 1. Cəhət, tərəf, yön. *Günəş səmtinə baxmaq. Dəniz səmtinə tərəf getmək. – Ağac səmtinə yıxılar.* (Ata. sözü). *Axirüləmr* [Məhəmmədhəsən əmi] *gəldi, tövləsini ortadan yarı böldü və küçəyə səmt bir qapı açdı.* C.Məmmədquluzadə.

2. İstiqamət. *Su səmtini tutmaq. Küləyin səmtilə getmək.*

3. *məc.* Yaxın adam, qohum-əqrəba mənasında. *Öz səmtindən qız almaq. – Aşkardı ki, qlava öz səmtini qoyub özgəni katdalıqda saxlamayacaq.* C.Məmmədquluzadə.

◊ **Səmt düşmək** – yaxınlaşmaq, yaxın düşə bilmək, yaxına getmək. *Xosrovdan başqa heç kəs bu havalı ata səmt düşə bilmirdi.* S.Rəhimov.

**SƏMTLƏNDİRMƏ** "Səmtləndirmək"dən *f.is.*

**SƏMTLƏNDİRMƏK** *f.* Bir şeyi müəyyən səmtə yönəltmək, istiqamətləndirmək.

**SƏMUM** *is.* [*ər.*] Asiya və Afrika səhralarında əsən çox şiddətli, isti və quru külək. // Ümumiyyətlə, şiddətli, isti külək. *Deyirlər: çox güclü və dəhşətli olur, səmum küləkləri.* O.Sarıvəlli. *Səmum yeli gəlir, aman; Yaz çıxmamış isti yayı, görəcəkdir qoca Muğan.* M.Dilbazi. // Məc. mənada. *Olur qarşısında polad mum kimi; Güllələr yağdırır yada qum kimi; Əsir başı üstə bir səmum kimi.* S.Rüstəm. *Hansı dərddir səmum olub, qəlb evində hey əsən?* Ə.Cəmil.

**SƏN** İkinci şəxs əvəzliyinin təki. *Sən istəyən kimi oldu. – Sən demədinmi dumada rəf olur ehtiyacımız? Mən də dedimmi çox yemə, tez pozulur məzacımız.* M.Ə.Sabir. [Əsgər:] *Ay Süleyman, yaxşı oldu sən gəldin, axı deyirlər ki, sən bir ağıllı adamsan, gəl görək, sən nə məsləhət tökürsən?* Ü.Hacıbəyov.

◊ **Sən allah, sən allahın** – bax **Allah**. [Məşədi İbad:] *A Həsənqulu bəy, sən allah, indi insaf eyləyin, sənin yanında Rüstəm bəy demədi ki, qızı sənə verirəm.* Ü.Hacıbəyov. [Gülsənəm:] *Ay yoldaş Ağa, sən allah, məni bu ağbirçək vaxtımda masqaraya qoyma.* H.Nəzərli. **Sən demə** – bax **demə**. *Sən demə, şeytan-şuğul bunu bəyə xəbər verib.* Ə.Vəliyev. **Sən öl** *dan.* – öz sözünü birinə inandırmaq istədikdə işlənir. *Sən öl, düz deyirəm.* **Sən hara, bura hara!** – gəlişi təəccüb doğuran, yaxud gözlənilmədən rast gələn adam haqqında. [Sultan bəy:] *Paho, Süleyman, sən hara, bura hara? Xeyirxəbər olasan, əyləş görək, nə var, nə yox?* Ü.Hacıbəyov.

**SƏNA** *is.* [*ər.*] *klas.* Tərif, mədh. *Duaçınam, salma məni nəzərdən; Əskik olmayasan sənadan, Pəri.* M.P.Vaqif. ☐ **Səna etmək** *klas.* – mədh etmək, tərif etmək. *Münəccimbaşı şahın hüzuruna daxil olub, ..əl-əl üstə qabaqda durub dua və səna etdi.* M.F.Axundzadə.

*Dalda qeybət, üzdə səna etmərəm; Gizli söyüş, zahir dua etmərəm*. M.Ə.Sabir.

**SƏNAMƏKİ** *is. bot.* Yarpaqları və meyvəsi xalq təbabətində işlətmə dərmanı kimi işlədilən bitki.

**SƏNAYE** *is.* [*ər.*] 1. Xalq təsərrüfatının, yeraltı sərvətləri çıxaran və xammalı emal edən müəssisələri birləşdirən sahəsi.

2. Maşın texnikası tətbiq edən fabrik-zavod müəssisəsi. *Neftçıxarma sənayesi. Yüngül sənaye. Ağır sənaye.*

3. *klas.* Sənətlər (peşə, sənət, iş). *Mən anlamaram elm nədir, ya ki sənaye; Zarəm bu əməldən!* M.Ə.Sabir.

◊ **Sənayeyi-nəfisə** *köhn.* – incəsənət(lər).

**SƏNAYEÇİ** *is.* 1. Kapitalist sənaye müəssisəsi sahibi; mədənçi, fabrikçi.

2. Mədəndə işləyən. *Neft sənayeçisi.*

**SƏNAYELƏŞDİRİLMƏ** "Sənayeləşdirilmək"dən *f.is.*

**SƏNAYELƏŞDİRİLMƏK** *məch.* Maşın texnikasına keçirilmək, maşın texnikası tətbiq edilmək.

**SƏNAYELƏŞDİRMƏ** "Sənayeləşdirmək"-dən *f.is. Sənayeləşdirmə planı.*

**SƏNAYELƏŞDİRMƏK** *f.* Xalq təsərrüfatının müəyyən və ya bütün sahələrini maşın texnikasına keçirmək. *Kənd təsərrüfatını sənayeləşdirmək. Ölkəni sənayeləşdirmək.*

**SƏNAYELƏŞMƏ** "Sənayeləşmək"dən *f.is.*

**SƏNAYELƏŞMƏK** *f.* Maşın texnikasına keçmək, maşınlar tətbiq etmək. *Ölkə yeni yollarla inkişaf etsin gərək; Sürətlə başdan-başa tez sənayeləşərək.* R.Rza.

**SƏNAYELİ** *sif.* Sənayesi olan, sənayesi inkişaf etmiş, sənayeləşmiş.

**SƏNCƏ** Sənə görə, sənin fikrincə, sən biləni. *Səncə, yarışın qalibi kim olacaq? Səncə, bu gün yığıncaq olacaq?* – [Firəngiz Muxtara:] *Buna, səncə, nə üçün* "*Gəlin qayası*" *deyirlər?* B.Bayramov.

**SƏNDƏL**[1] *is.* [*ər.*] 1. *bot.* Oduncağı efir yağı ilə zəngin olan ətirli, həmişəyaşıl tropik ağac. *Aşığın sən dəlisi; Gözəllər sən dəlisi; Sevdiyim, zülflərindən; Gəlir səndəl iyisi.* Sarı Aşıq. *Nizami məzardaşını döyərək Xaqanini səslədi, gözündən bir damcı yaş düşərək qəbir daşının dalında yandırılan səndəlin üstünə düşdü.* M.S.Ordubadi. // Bu ağacdan qayrılmış. *Məst edər aləmi ənbərin budan; Hər gələndə səndəl darağa zülfün.* M.P.Vaqif.

2. Bu ağacın oduncağından, habelə bəzi başqa ağaclardan alınan boya.

**SƏNDƏL**[2] *is.* Dal söykənəcəyi olan qoltuqlu stul. [Mərcan bəy] *yıxılır səndəlin üstə, ürəyi bitab olan tək olur.* Ü.Hacıbəyov. *Səndəllərin hamısına yumşaq və məxmər balışlar olduqca müntəzəm bir surətdə qoyulmuşdu.* M.S.Ordubadi. [Mirzə Həsən atasına:] *Kitab da yazmışam, hazırdır. Miz, səndəl hazır olunca onu çap etdirərəm.* P.Makulu.

**SƏNDƏL**[3] *is.* [*yun.*] Qədim yunanların və romalıların geydikləri dabansız, yüngül ayaqqabı. // Üzü bağla bağlanan dabansız, yüngül yay ayaqqabısı. *Uşağa səndəl almaq.* – [Aslan] *çəkmə mağazasına girdi, axırıncı pulunu verib, bir cüt yüngül səndəl aldı.* S.Vəliyev.

**SƏNDƏLƏMƏ** "Səndələmək"dən *f.is.*

**SƏNDƏLƏMƏK** *f.* Müxtəlif səbəblərdən müvazinəti itirərək, ayaq üstə dura bilməyib yırğalanmaq. *Səlim sillənin zərbindən səndələdi.* M.İbrahimov. [Firuz] *müvazinətini itirərək yerində səndələdi.* Ə.Məmmədxanlı.

**səndələyə-səndələyə** *zərf* Yıxıla-dura, yırğalana-yırğalana, o yan-bu yana əyilərək. *Məmiş kişi də mənim xətrimi çox istəyir – deyə, Səməd səndələyə-səndələyə Əlləzoğluna sarı yeridi.* İ.Hüseynov.

**SƏNDƏLİ** b a x **səndəl**[2]. *Nəcəf kişi o zamanın adəti üzrə papağı başında, səndəlidə oturub dil-ağız etdi.* M.İbrahimov.

**SƏNDİRLƏMƏ** "Səndirləmək"dən *f.is.*

**SƏNDİRLƏMƏK** b a x **səndələmək**. *Ovçu nişan aldı, ox çıxdı yaydan; Alagöz bir maral qana boyandı;* "*Ah!*" *səsi yüksəldi bulaqdan, çaydan; Maral səndirlədi, maral dayandı.* N.Xəzri. *Nərgiz .. səndirləsə də, özünü düzəldə bildi, daşın üstünə çıxıb atı mindi.* B.Bayramov.

**SƏNƏ** *is.* [*ər.*] İl. *Bir gecəlik mətləbin bir sənə mabədi var.* M.Ə.Sabir. *Millətin beş sənə bundan əqdəm; Yüz nəfərdən biri tutmazdı qələm.* A.Səhhət. *Çox vaxt bir sənəyə qədər nişanlı halında qız atası evində qalacaqdır.* R.Əfəndiyev.

**SƏNƏD** *is.* [*ər.*] 1. Bir şeyi, faktı təsdiq, bir şeyə olan hüququ sübut edən rəsmi kağız. *Arxiv sənədləri. – C.Məmmədquluzadənin*

*təsvirinə və tarixi sənədlərə görə o zaman Azərbaycan dilində qəzet çıxarmaq çox çətin məsələ imiş.* M.İbrahimov.

2. Təqdim edənin şəxsiyyətini təsdiq edən vəsiqə. *Tələbənin sənədlərini yoxlamaq. – Dərs hissəsi müdiri sənədləri alıb nəzərdən keçirdi, başını qaldırıb onun üzünə gülümsədi.* S.Rəhimov. *Axırda qət olundu ki, tədqiqat getsin, Vahidin sənədlərini yoxlatmaq direktora tapşırılsın.* Mir Cəlal.

**SƏNƏK** b a x **səhəng**. *Su sənəyi axırda suda sınar.* (Məsəl). [Mələk] *lalə kimi rəng verib, rəng ala-ala bulağa endi, sənəyi bulağa söykədi, su gurhagur sənəyə doldu.* A.Divanbəyoğlu. *Az keçməmiş gəlinlər gəlib onun komasını suvadılar, su dolu bir sənək gətirdilər.* Ə.Məmmədxanlı.

**SƏNƏM** *is.* [*ər.*] 1. *klas.* b a x **büt** 1-ci mənada. *Surəti ziba sənəmlər yox demək bütxanədə; Var çox, əmma sənə bənzər büti-xunxar yox.* Füzuli.

2. Gözəlin epitetlərindən biri – dilbər. *O qədər sənəm var ki, yasəmənə vaxt yoxdur.* (Ata. sözü). *Yenə yada düşdü bizim sənəmlər; Getməyin binası, hayıf ki, yoxdur.* M.P.Vaqif. [Mərcan bəy:] *Bir saatdan sonra bir nazənin sənəm gələcəkdir.* Ü.Hacıbəyov.

**SƏNƏT** *is.* [*ər.*] 1. Müəyyən hazırlıq tələb edən və sahibinin yaşaması üçün əsas mənbə sayılan əmək fəaliyyətinin bir növü; peşə. *Özünə sənət seçmək. Sənət öyrənmək. Sənətini dəyişmək.* – [Yusif] *usta Xəlilin yanında qırx yaşında ikən sərraclıq sənətini bir il müddətində öyrənib Qəzvinə müraciət etdi.* M.F.Axundzadə. [Qurban Nənəxanıma:] [Şaqqulunu] *istəmişəm sənətə qoyam ki, avara qalmasın, demisən ki, o neynir sənəti, cavan uşaqdı, qoy böyüsün.* Çəmənzəminli. *..Qulam müəllim bütün sənətlər içərisində öz sənətini* [müəllimliyi] *çox yüksək tuturdu.* S.Rəhimov. // İş, peşə, məşğuliyyət. *Hacının sənəti hamamçılıq idi...* C.Məmmədquluzadə. *Gördü ayı kəndli çəkir zəhməti; Var əcəb asudə, asan sənəti.* // A.Səhhət. *Gəmi muzdurçuluğu .. çox ağır sənətdir.* S.M.Qənizadə // Məc. mənada. [Sultan bəy:] *Qərəz ki, təklik bir sənət deyildir.* Ü.Hacıbəyov. *Yaxşılıq insana bir sənət olsun; Dünya başdan-başa qoy cənnət olsun.* S.Vurğun.

2. İncəsənətin qollarından hər biri. *Musiqiçilik gözəl sənətdir. Bədii sənətin gücü. Sənət əsəri. – Əsil tamaşaçılar* [Səttarzadəni] *görəndə musiqi aləminin, sənət dünyasının zənginliklərini bir daha xatırlayırlar.* Mir Cəlal.

3. B a x **sənətkarlıq** 2-ci mənada.

◊ **Sənət məktəbi** – ixtisaslı fəhlə hazırlayan məktəb. [Aslan:] *Mən sənət məktəbini təzə qurtarmış ustaların briqadiriyəm.* S.Rəhman. *Sənət məktəbinə məxsus göy rəngli paltar Həsənlə Lətifə çox yaraşırdı.* H.Seyidbəyli.

**SƏNƏTÇİ** b a x **sənətkar** 1-ci mənada.

**SƏNƏTKAR** *is.* [*ər.* sənət və *fars.* ...kar] 1. Hər hansı bir sənətlə məşğul olan, sifarişlə iş qəbul edib öz əmək alətləri ilə, kustar üsulla məhsul hazırlayan şəxs, usta; bir sənətlə keçinən adam. *Burada əlli üç minə qədər müxtəlif yerlərdən gəlmiş fəhlələr, ustalar, sənətkarlar vardır.* M.S.Ordubadi. *Gənc sənətkarlar neftçilər üçün borusıxan hazırlamalı idilər.* H.Seyidbəyli.

2. Öz işində, peşəsində, sənətində böyük məharət və ustalıq qazanmış şəxs. [Şair Ərəstun:] *Elə mən də böyük sənətkarlardan, şeirdə böyük hünərdən, coşqun bir ilhamdan danışıram.* S.Rəhimov. *Heç şübhəsiz ki, Nizami, Xaqani və Nəsimi kimi böyük sənətkarlar müəyyən tarixi-ədəbi hazırlıq olmadan meydana çıxa bilməzdi.* M.İbrahimov.

**SƏNƏTKARANƏ** *sif.* və *zərf* [*ər.* sənət və *fars.* ...karanə] Sənətkarlıqla, ustalıqla, məharətlə, bacarıqla; mükəmməl surətdə, nümunəvi surətdə. *Sənətkaranə işlənmiş divar naxışları. Sənətkaranə təsvir.*

**SƏNƏTKARLIQ** *is.* 1. Öz sənətini yaxşı bilmə; ustalıq. *Dərzinin sənətkarlığına söz yoxdur.*

2. Hər hansı bir sahədə böyük bacarıq, məharət, hünər, ustalıq. *Sənətkarlıq nöqteyi-nəzərindən zəif əsər. Aktyor sənətkarlığı. Müasirlik və sənətkarlıq bir-birini tamamlayır.*

**SƏNƏTŞÜNAS** *is.* [*ər.* sənət və *fars.* ...şünas] Sənətşünaslıq mütəxəssisi, incəsənətin hər hansı sahəsi üzrə mütəxəssis olan alim.

**SƏNƏTŞÜNASLIQ** *is.* İncəsənətlər (əsasən təsviri incəsənət) haqqında elm. *Sənətşünaslıq doktoru.*

**SƏNGƏK** *is.* [*fars.*] Uzun, yastı çörək növü. [Usta] *şagirdinin vərdənə ilə yaydığı kündələri kürəyə sərir, tez-tez oda atır, neçə dəqiqə keçməmiş buğlanan səngəkləri qızmar kürədən çıxarırdı.* Mir Cəlal. *Ertəsi gün səhər tezdən Məmməd bazardan təzə səngəklə pendir aldı.* P.Makulu.

**SƏNGƏKÇİ** *is.* Səngək bişirib satan adam, çörəkçi. *Qoca dayanır, səngəkçi şagirdi bir neçə səngək büküb qocaya verir.* Ə.Məmmədxanlı.

**SƏNGƏR** *is.* Gülləddən, qəlpədən qorunmaq üçün qazılan çuxur, xəndək. *Səngər qazımaq. Səngərdə gizlənmək. – Nəbi cəld özünə bir səngər tapıb daldalanandan sonra aynalı tüfəngi işə salır.* "Qaçaq Nəbi". *Döyüşçülər yeni qazıdıqları üstüörtülü səngərdə oturmuşdular.* Ə.Vəliyev.

**SƏNGƏRLƏNMƏ** "Səngərlənmək"dən *f.is.*

**SƏNGƏRLƏNMƏK** *qayıd.* Səngərdə gizlənmək, səngərə girmək. *Əsgərlər səngərləndilər. – Körpüdəki partizanlar .. çuxurlarda səngərləndilər.* M.Hüseyn.

**SƏNGİMƏK** *f.* 1. Yavaşımaq, azalmaq.

2. Daşlaşmaq (hərəkətsiz olmaq mənasında).

3. İnkişafdan qalmaq, ləngimək.

**SƏNGİN** *sif.* [*fars.*] 1. Bərk, sərt.

2. Ağır. *Oylə səngindir ki, əsqali-təəssübdən yüküm; Gündə min tərpənsə yer, tərpənməz əsla bir tüküm!* M.Ə.Sabir.

3. *məc.* Qəddar.

**SƏNLİK** *is.* Sənə aid, səninlə bağlı, sənə dəxli olan. *Bu məsələ sənlik məsələ deyil.* – [Vəzir Hacı Salaha:] *Olan, sənlik nə var? Sənə hər nə buyururam, elə elə.* M.F.Axundzadə. [Hacı Mehdi:] *Sənlik ki bir iş yoxdur.* Ə.Haqverdiyev.

**SƏNLİ-MƏNLİ** 1. *is.* Sən, mən, hamımız, hamı bir yerdə, hamılıqla, birgə. *Sənli-mənli birləşək, işi yerinə yetirək.* – [Qurban Telliyə:] *Orası elədir, Telli, amma qorxuram sənli-mənli bütün kolxoza söz gələ.* Ə.Məmmədxanlı.

2. *zərf* Öz aralarında, ikilikdə; məhrəmanə, öz aramızda. [Telli] *bu barədə düşünürdü; yenə əvvəlki kimi üzünü* [müəllimdən] *tutub yaşınsın və ya bu gecəki kimi onunla sənli-mənli danışsın.* S.Hüseyn.

**SƏNUBƏR** *is.* [*ər.*] 1. Şam ağacı, küknar.

2. *məc.* Gözəlin boyu, qaməti.

**SƏPƏLƏMƏ** "Səpələmək"dən *f.is.*

**SƏPƏLƏMƏK** *f.* 1. Bir şeyi müxtəlif tərəfə necə gəldi atmaq, dağıtmaq, töküşdürmək, yaymaq. *Bunlardan əlavə,* [Əbiş] *şkafın gözlərini eşələyir, kağızlardan çıxarır, stolun üstünə səpələyirdi.* S.Rəhimov.

2. Səpmək, tökmək. *Buğda səpələmək. Darı səpələmək. – ..Afaq çoxdan bu yerləri tərk etmiş quşları da geri qaytarmaq istəyərək, bağçadakı təpəciyə gətirib bir çanaq arpa səpələdi.* Ə.Məmmədxanlı.

3. Sovurmaq, sıçratmaq. *Külək qarı səpələr, – Bəxtiyar! Ağ geyinər təpələr, – Bəxtiyar!* R.Rza // Narın-narın yağmaq, çiləmək. *Arabir narın yağış da səpələyir, soyuq adamın iliklərinə işləyirdi.* M.Rzaquluzadə.

**SƏPƏLƏNMƏ** "Səpələnmək"dən *f.is.*

**SƏPƏLƏNMƏK** *f.* 1. Dağılmaq, ora-bura tökülmək, qeyri-müntəzəm halda tökülmək. *Kitablar yerə səpələnib. – Son dəftəri yoxlayıb qurtaran müəllim cib saatını çıxarıb baxdı, stol üstünə səpələnmiş* (f.sif.) *dəftərləri toplayıb sahmana saldı.* S.Rəhimov. *Lalənin ləçəkləri yerə səpələndi.* M.Hüseyn. [Zakirin] *saçları dağılıb üzünə səpələnmişdi.* H.Seyidbəyli. // Tökülüşmək. *Sərnişinlər qatardan yerə səpələndilər. – Rüstəm kişi dəstə-dəstə yollar boyu səpələnib irəliləyən kolxozçu qadın və kişiləri gördü.* M.İbrahimov. *Gələn atlılar sağa-sola səpələndilər.* M.Hüseyn.

2. Çilənmək. *Qırov səpələndi çölə, yamaca; Göylərdə buz kimi dondu ulduzlar.* S.Vurğun. *Göydən xırda yağış səpələnirdi.* Ə.Vəliyev.

**SƏPGİ** *is.* Dəri üzərində əmələ gələn keçici iltihablı qabarcıqlar; sızaq, səpişik.

**SƏPGİLİ** *sif.* Səpgi olan, səpmiş, səpməli. *Səpgili üz.*

**SƏPİCİ** 1. B a x **səpinçi**.

2. B a x **toxumsəpən**. *Səpici maşınlar. Səpici alət.*

**SƏPİLMƏ** "Səpilmək"dən *f.is.*

**SƏPİLMƏK** "Səpmək"dən *məch. Xanın yumruğunun zərbindən pəncərə çilik-çilik olub yerə səpildi.* Çəmənzəminli. *Düşdükcə günəş qırmızı bayraqların üstə; Güllər səpilər sanki bu torpaqların üstə.* S.Rüstəm.

*Səpindən sonra cərgələrin üstünə çürümüş peyin səpilmişdi*. Ə.Əbülhəsən.

**SƏPİN** *is. k.t.* Toxum səpmə işi. *Səpin işləri yaxşı gedir. – Bəzi yerlərdə sabahdan səpinə başlamaq olardı.* M.Hüseyn. *Yaz gəlib səpin başlananda Əli əsil ustalığını, məharətini göstərdi*. B.Bayramov.

**SƏPİNÇİ** *is.* Tarlaya, torpağa toxum səpən adam. *Toxumsəpən maşına təcrübəli səpinçilər təhkim edilməlidir.*

**SƏPİNQABAĞI** *is.* Tarlanın sürülməsi ilə səpin arasındakı vaxt, səpindən əvvəl. *Səpinqabağı malalamaq. Əkin yerini səpinqabağı kol-kosdan təmizləmək.*

**SƏPİNTİ** *is.* Hündürdən tökülən, fışqıran sudan əmələ gələn su zərrəcikləri; sıçrantı. [Ayın] *işıqları böyük fontanın səpintiləri arasından keçir*(*di*).. M.S.Ordubadi.

**SƏPİŞİK** b a x **səpgi**.

**SƏPKİ** *is.* Şəkil, biçim, üsul, tərz, qayda. *Bir səpkidə evlər tikilmək. Eyni səpkidə ağac əkmək. – Bəli, indi kəndlilərə bir səpkidə olan, bir biçimli, bir donlu adam kimi baxmaq dürüst olmazdı*. S.Rəhimov. // Üslub, tərz, üsul. *Şərq səpkisində musiqi. – Vaqifin əbnayivətənə vəz və nəsihət səpkisində yazdığı müxəmməsin məali-pürməzmunu həmişə doğruluq üzrə qalıb*. F.Köçərli. “*Bahadır və Sona*” *öz üslubu ilə də fərqlənir. Bu kiçik roman lirik səpkidə yazılmışdır.* M.Arif.

**SƏPMƏ¹** “Səpmək¹”dən *f.is.*

**SƏPMƏ²** 1. “Səpmək²”dən *f.is.*

2. B a x **səpki**.

**SƏPMƏK¹** *f.* 1. Toxumu səpin üçün hazırlanmış torpağa səpələmək; toxum atmaq, əkmək. *Çiyid səpmək. – ..Vəliqulu çöldə idi. Zəmiyə toxum səpirdi.* C.Məmmədquluzadə. [Tarverdi:] *..İkicə pud bu il yerə* [buğda] *səpdim*. C.Cabbarlı.

2. Tökmək (toz halında olan şeylər haqqında). *Tarlaya dərman səpmək. Qapının qabağına qum səpmək. – Firəngiz göbələklərin çökəyinə duz səpib, bir-bir közün üstünə düzürdü*. B.Bayramov. // Dən atmaq, yem tökmək. [Novruzəli xana:] *Xan, qadanı alım, bu xoruzlar qaldılar burada, heyvandılar, qoyaydın qıçlarını açıb bir az burada dən səpəydim.* C.Məmmədquluzadə. *Sənəm qarı balağından çəngə ilə dən götürüb .. toyuqcücələrə səpirdi*. Ə.Məmmədxanlı. // Çiləmək, tökmək, səpələmək (maye haqqında). *Başına ətir səpmək. – Araşqının təpəndə; Üzə gülab səpəndə; Könül çatar murada; Ağ üzündən öpəndə*. (Bayatı). *Əyyarlar başladılar Dəmirçioğlunun üstünə bihuşdarı səpməyə.* “Koroğlu”. *..Nökərlər də Rzaquluxanın üzünə su səpib huşa gətirməyə çalışırdılar*. M.S.Ordubadi.

3. Pərakəndə halda atmaq, necə gəldi atmaq, tökmək, tökübtöküşdürmək. *Paltarları evin içinə səpmək. – Bir gün Sürəyyanın cehizlərini qayınatası çıxardıb, evdən birbəbir həyətə səpdi.* Çəmənzəminli. [Birinci fəhlə:] *Budur ha, genə kağız səpiblər ki...* H.Nəzərli.

4. Yağmaq, səpələmək. *Yağış səpir. – Səpir qarı ağaclara, kollara; Dərələrə, təpələrə, yollara*. A.Səhhət.

5. Atmaq (çoxlu miqdarda). *Səlim dayana bilmədi. Bir qatar güllə səpdi..* Mir Cəlal.

6. Obrazlı təşbehlərdə: işıq səpmək, nur səpmək, səadət çiçəyi səpmək və s.

7. Bir sıra isimlərlə işlənərək müxtəlif ifadələr düzəldilir; məs.: yarasına duz səpmək, gözünə torpaq səpmək, ürəyinə soyuq su səpmək və s.

**SƏPMƏK²** *f.* Dərisi səpgi tökmək, səpgi çıxarmaq. *Üzü səpmək. Qolları səpmək.*

**SƏPSUVAR** *sif. k.t.* Səpindən sonra torpağı dərhal suvarma üsulu. *Səpsuvar əkin*. – [Oruc kişi:] *Sən özün bilirsən ki, bu il mən də, bax bu Əlipaşa da arat qoya bilmədik. İkimiz də səpsuvar* (z.) *əkdik.* T.Ş.Simurq.

**SƏR** [*fars.*] *klas.* 1. *is.* Baş. [Qurbani:] *Sərim sadağadı, üzüm payəndaz; Candan qeyri yoxdur bir matah məndə.* “Qurbani”. *Ələsgərin ağlın aldın sərindən; Saf gövhərsən, sərraf seçib dərindən*. Aşıq Ələsgər.

2. *sif.* Ən yaxşı, əla, baş. [Nəbi:] *Boz at, səni sər tövlədə bağlaram; Qabağına yağlı quyruq doğraram*. “Qaçaq Nəbi”.

**SƏRAB** [*fars.*] b a x **ilğım**. *Hər şey dəniz kimi bərq vuran bir sərab içində itib gedirdi.* İ.Əfəndiyev. ☐ **Sərab olmaq, sərabə dönmək** *məc.* – xəyal kimi yox olub getmək, puça çıxmaq, yox olmaq. *Əməllərim bir səraba dönərkən; Çaşıb verdim şimşəklərə könlümü.* M.Müşfiq.

**SƏRAPƏRDƏ** *is.* [*fars.*] *köhn.* Şərq padşahlarının saraylarında böyük qəbul otağının

qapısında və ya hərəmxana ilə qonaq və qəbul otağı arasında böyük pərdə. *Dövlət adamları həyətə yığılıb, şahın pəncərədə sərapərdənin arxasından görünməyini gözləyirdilər.* Çəmənzəminli. // Keçmişdə padşahların özlərinə məxsus olan otaq.

**SƏRASƏR** *zərf* [*fars.*] Başdan-başa, bütünlüklə, tamamilə, bütöv, tamam, başdan-ayağa. *Sevdiyim, ləblərin yaquta bənzər; Sərasər dişlərin dürdanədəndir.* M.P.Vaqif. *Sərasər əlvana batsın gül bədən; Siyah zülfün töksün qamətinəmən.* Q.Zakir. // Eyni mənada vaxt haqqında. [Səkinə xanım:] *Biçarə iki il sərasər mərhum qardaşıma yalvardı ki, məni yola versin.* M.F.Axundzadə. *Neçə gündü ki, sərasər yağış yağırdı.* H.Seyidbəyli.

**SƏRASİMƏ** *zərf* [*fars.*] Hövlnak, qorxu içərisində, dəhşət içərisində, vahiməli. [Molla] *sərasimə yuxudan oyanıb yanında yatan arvadını dürtmələyir ki: – Arvad, dur!* "M.N.lətif." *Şəhrəbanu xanım sərasimə yerindən qalxır, qorxu ilə gedir qapıya sarı.* M.F.Axundzadə.

**SƏRBAZ** *is.* [*fars.*] Əsgər, döyüşçü (İranda). [Səttarxan:] *Hər ikimiz üsyan ordusunun bir sərbazıyıq.* M.S.Ordubadi. *Divanxananın qabağı silahlı sərbaz və göy mahud geyimli vəliəhd fərraşları ilə dolu idi.* P.Makulu.

**SƏRBAZXANA** *is.* [*fars.*] Əsgər qışlası, sərbazların yaşadığı ev (İranda). *Sərbazxananın iki qapısı vardı.* P.Makulu.

**SƏRBAZLIQ** *is.* Əsgərlik (İranda).

**SƏRBƏSƏR** [*fars.*] bax **sərasər**. *Tavuz kimi cilvələnə hər səhər; Bəzək verə camalına sərbəsər.* M.P.Vaqif. *Şaxta qurutmuş bədənin sərbəsər; Zərrəcə yox hissdən onda əsər.* A.Səhhət. *Vətənim al geyir indi sərbəsər; Göy şamlar bürüyür sahili yenə.* O.Sarıvəlli.

**SƏRBƏST** *sif.* və *zərf* [*fars.*] 1. Başqasından asılı olmayan, özü öz ixtiyarında, başqası ilə bağlı olmayan; müstəqil. *Ah, bu çocuqlar olmasa idilər, Zeynal nə qədər sərbəst və bəxtiyar olacaqdı.* S.Hüseyn. // Azad, hürr. *Sərbəst həyat. – Söylə, nə göstərim bu günə dair; Könüllər sərbəstdir, duyğular azad.* S.Vurğun. // Heç bir şeylə məhdud edilməyən, maneəsiz. *Sərbəst seçkilər. Sərbəst ticarət. Sərbəst fikir mübadiləsi.*

2. Sıxılmadan, çəkinmədən, istədiyi kimi, təklifsiz. *Mayanın Qaraşla belə sərbəst rəftarı, hətta ona söz buyurması Rüstəm kişiyə xoş gəlmədi.* M.İbrahimov. // *zərf* Maneəsiz, çətinliksiz. *Özünü sərbəst hiss etmək. – Sübhanverdizadə arxası üstə çevrildi. İndi onun qolları hər yana sərbəst hərəkət edə bilərdi.* S.Rəhimov. *Qadir, yəhərdə sərbəst oturmadığına baxmayaraq, dönüb .. qızılı şəfəqlərə diqqət etdi.* Ə.Əbülhəsən.

3. Öz gücü, öz bacarığı ilə, təkbaşına, müstəqil. *Mövzunu sərbəst işləmək.* // Asanlıqla, çətinlik çəkmədən.

**SƏRBƏSTCƏ(SİNƏ)** *zərf* 1. Tamamilə sərbəst, müstəqil, başqasından asılı olmadan. *Sərbəstcə yaşamaq.* // Asanlıqla, heç bir çətinlik çəkmədən, tamamilə sərbəst. *Rusca sərbəstcə danışır.*

2. Çəkinmədən, utanmadan, sayğısızcasına. *Sərbəstcəsinə hərəkət. – Xalıqverdi kişinin gözlədiyinin əksinə, Ataş əsla utanmadan, sərbəstcə cavab verdi.* Ə.Vəliyev. // Sadəcə, heç bir şeylə hesablaşmadan. [İskəndər kişi] *şapkasını götürüb sərbəstcə stolun üstünə atdı.* İ.Hüseynov.

**SƏRBƏSTLƏŞMƏ** "Sərbəstləşmək"dən *f.is.*

**SƏRBƏSTLƏŞMƏK** *f.* Sərbəst olmaq, heç kəsdən asılı olmamaq.

**SƏRBƏSTLİK** Azadlıq. [Məhkəmə sədri:] *Sənin talaq verməməyin Tellinin sərbəstliyini əlindən ala bilməyəcəkdir.* S.Hüseyn. *Əbil fikir aləminə qapılıb kəhər atın cilovunu boşaltmış, ona tamam sərbəstlik vermişdi.* Ə.Vəliyev.

**SƏRÇƏ** *is. zool.* Tükləri qəhvəyi-boza çalar, adətən yaşayış binalarının yaxınlığında yaşayan kiçik quş. *Bala sərçə. – Builki sərçə bildirki sərçəyə cib-cib öyrədir.* (Məsəl).

**SƏRDABƏ** *is.* [*fars.*] Bir və ya bir neçə ölünün basdırıldığı üstü tikili qəbir; məqbərə. *Tabutu sərdabəyə qoymaq. Şirvanşahlar sərdabəsi. – Sən get qəbiristanda bir sərdabədə gizlən ki, bu zalımlar səni tapa bilməsinlər.* C.Cabbarlı.

**SƏRDAR** *is.* [*fars.*] 1. *tar.* Keçmişdə: bir vilayəti idarə edən və dövlət başçısı adından sərəncam vermək hüququna malik olan hakim. *Qafqaz sərdarı. –* [Vəkillər] *..bu ərizələri*

*və siyahıları makinada səliqə ilə çap eləyib, gətirib qoymuşdular sərdarın qabağına*. C.Məmmədquluzadə. *Gorus naçalnikindən başlayıb, Gəncə qubernatından ötüb, Tiflisdəki sərdara qədər padşaha hey xəbər yazılır, yuxarıdan hey fərman gəlirdi*. S.Rəhimov.

2. Başçı. [Koroğlu Eyvaza:] *Səni Çənlibelə özümə oğul, dəlilərə sərdar eləməyə aparıram*. "Koroğlu". // *məc*. Obrazlı təşbehlərdə. *Gözəllər sərdarı. – Hüsnün sərəsgəri, vəslin sərdarı; Haşa gələ bu sığnağın üstünə*. Q.Zakir. *Sən ey gül fəslinin dildarı lalə; Yaşıl çəmənlərin sərdarı lalə!* N.Rəfibəyli.

**SƏRDARI** *is. köhn.* Keçmişdə əyanların geydiyi uzun üst geyimi. *Ləbbadəni çıxarıb yaxşı bir sərdarı geymiş olsaydın, lap nişanlı bir oğlan şəklinə düşəcəkdin, – deyə Sərdar güldü*. M.S.Ordubadi. [Camaatın] *içərisində .. sərdarı geyinmiş əyanlardan tutmuş, keçə börklü kənd varlılarınadək hər təbəqədən olanlara rast gəlmək olardı*. P.Makulu.

**SƏRƏFRAZ** *sif.* və *zərf* [*fars.*] *klas.* Başı uca. *Sərəfraz gəzirsən büllur otaqda; Uzaqda oduna yananı gözlə!* Aşıq İman. ☐ **Sərəfraz buyurmaq** *tənt*. – bax **sərəfraz etmək**. *Mən özümü borclu hesab edirəm, sizdən razılıq eləməyə ki, bu uzun yolu zəhmət ilə buraya gəlib, məni sərəfraz buyurubsunuz*. C.Məmmədquluzadə. *Xeyli sərəfraz buyurmuşsunuz, biz ata-babadan xalqın məsləhəti ilə hökumət sürmüşük...* M.S.Ordubadi. **Sərəfraz etmək (eyləmək, qılmaq)** – gəlməyi və ya başqa bir hərəkəti ilə birinin başını uca etmək, hörmətini qaldırmaq, hörmətə mindirmək, adamların gözündə yüksəltmək; şərəfləndirmək. *Məcnun dedi: Ey açan mənə raz; Lütfilə qılan məni sərəfraz!* Füzuli. [Ağa Kərim xan:] *Əziz qonaq bizi sərəfraz edib, xoş gəlib..* N.Vəzirov. **Sərəfraz olmaq** – başı uca olmaq, yüksəlmək. *Nazənin-nazənin edərsiz avaz; Ruh tazələnir, olur sərəfraz*. M.P.Vaqif.

**SƏRƏK** *is.* Gic, səfeh. *Tacir bilirdi ki, Səlim necə sərəkin biridi. Qızı ona vermək istəmədi*. (Nağıl). [Sona Qadirə:] *A sərək, mən sınamaq istəyirdim, – demişdi*. Ə.Əbülhəsən.

**SƏRƏLƏNMƏ** "Sərələnmək"dən *f.is.*

**SƏRƏLƏNMƏK** bax **sərilmək**[1] 1-ci mənada. [Mehriban] *qapının ağzında yerə sərələndi*. S.Hüseyn.

**SƏRƏNCAM** *is.* [*fars.*] 1. Əmr, göstəriş. *Səməndər qayda-qanunu bilmədiyi üçün sərəncam gözləyirdi*. B.Bayramov. ☐ **Sərəncam çəkmək** – bir şeyi həll etmək, qaydaya salmaq üçün sərəncam vermək, göstəriş vermək, tədbir görmək. *İnmirə məhəlləsində bir ittifaq düşərdisə, tez* [Əmi] *özü gedərdi, işlərinə diqqətlə baxardı, sərəncam çəkərdi*. N.Nərimanov. [Müdir:] *İndi ki, deyirsən mən kəndli qızıyam, sözümüz yoxdur, gətir, ərizəni ver, görək bir sərəncam çəkə bilərikmi? – demiş və nəhayət, Zeynəbi məktəbə götürmüşdür*. Qantəmir. // Həll etmək, xitam vermək. [İbrahim kişi:] *Gərək, Mehralı, elə günü bu gün işə sərəncam çəkək*. S.Rəhman. **Sərəncam olmaq** – göstəriş verilmək. *Nahar tədarükü oldu sərəncam; Qoyuldu süfrəyə qımız, gümüş cam*. A.Səhhət. **Sərəncam vermək** – göstəriş vermək, əmr vermək. *Kağızlar qalaq-qalaq; Miz üstünə sərilir; Qol çəkilir anbaan; Sərəncamlar verilir*. N.Xəzri.

2. Aqibət, son, nəticə, axır. *Yaxşı görünür surəti məhvəşlərin, əmma; Yaxşı nəzər etdikdə sərəncamı yamandır*. Füzuli.

3. **Sərəncamında** – əlində, ixtiyarında. *Belə hallarda düşüncə və kədəri dostlara danışmaq və onların sərəncamında olan imkanlardan istifadə etmək lazımdır*. M.S.Ordubadi. *Opera əsərinin tərkibinə daxil olan bütün bu saydığımız cəhətlər göstərir ki, opera bəstələyən kompozitorun sərəncamında çox geniş ifadə imkanları vardır*. Ə.Bədəlbəyli.

**SƏRƏNCAMÇI** *is.* Tapşırılan işə məsul olan və bilavasitə ona rəhbərlik edən adam.

**SƏRF**[1] *is.* [*ər.*] Xərc; sərf etmə, xərcləmə, işlətmə. ☐ **Sərf etmək (eləmək, qılmaq)** – 1) xərc etmək, işlətmək, xərcləmək, pul və s. qoymaq (bir işə). *Əziz balalar!.. Məktəb vasitəsilə öyrəndiyimiz elmləri, fənləri insanlar arasında intişar etmək fikrində bulunduq, .. biz üç yoldaş qüvvətimizi sərf etdik*. N.Nərimanov. *Əziz artıq pul sərf edib özgə maşınına xəlvət minməyi sevməzdi*. S.Rəhman; 2) xeyir vermək, xeyirli olmaq, lazım olmaq, sərfəli olmaq. *Kar özünə sərf eyləyəni eşidər*. (Ata. sözü); 3) həsr etmək. *Qulam müəllimin arzusu o idi ki, yetmiş-həştad yaşına qədər ömür sürsün və bu ömrün hamısını da müəllimliyə sərf etsin..* S.Rəhimov. [Dustaq] *vax-*

*tının çoxunu oxumağa, yazmağa sərf edirdi*. Ə.Vəliyev.

**SƏRF**[2] *is.* [*ər.*] *qram.* Morfologiyanın köhnə adı.

**SƏRFƏ** *is.* Mənfəət, xeyir, fayda. *Bu işin sənə sərfəsi yoxdur*.

**SƏRFƏLİ** *sif.* Xeyirli, mənfəətli, faydalı, əlverişli. *Sərfəli iş*. – [Dərya:] *Belə bilirəm ki, adamın canına, ruhuna, əsəbinə bifayda mətləblərdən xali olsan sərfəlidir*. B.Bayramov.

**SƏRFƏSİZ** *sif.* və *zərf* Xeyirsiz, faydasız, əlverişsiz, əbəs, hədər. *Sərfəsiz iş. Sərfəsiz saziş*. – *Nəqdi-ömrüm sərfəsiz xərc eylədim bazaridə*. Q.Təbrizi.

**SƏRFİYYAT** *is.* [*ər.* "sərf" söz. cəmi] *köhn.* Sərf olunan şeylər, xərc olunan pullar; məxaric.

**SƏRF-NƏHV** *is.* [*ər.*] Qrammatikanın köhnə adı.

**SƏRF-NƏZƏR** *is.* [*ər.*]: **sərf-nəzər etmək** – bir şeyi nəzərə almamaq, fikrini, diqqətini, nəzərini ondan uzaqlaşdırmaq, ayırmaq; nəzərini çevirmək. *Bu məsələdən sərf-nəzər etdi*. – [Sənubər Hidayətə:] *Seysmik imkanlardan sərf-nəzər eləmək, .. əhalinin taleyini hər hansı göstərişə, tələbə qurban vermək olarmı?* B.Bayramov.

**SƏRGƏRDAN** *sif.* və *zərf* [*fars.*] Yersiz-yurdsuz, sərsəri, avara. *Sərgərdan adam*. – *Ata-ana nazı ilə böyümüş Budaq indi çox şeyə tamarzı qalırdı. O, avara, səfil və sərgərdan həyat sürürdü*. Ə.Vəliyev. // Başını itirmiş, çıxış yolu tapa bilməyən. *Yazıq Ələsgərəm, sərgərdan canım; Qurban sizin kimi dosta, gözəllər!..* Aşıq Ələsgər. *Boynu çiynində, qoltuğunda əli; Zarü-məhzun, məluli-sərgərdan*. C.Cabbarlı. ◻ **Sərgərdan gəzmək (dolanmaq)** – veyillənmək, işsiz-gücsüz, bikar gəzmək, avaralanmaq. *Ey soran halım mənim, mən bir dili-sədparəyəm; Eşq səhrasında sərgərdan gəzən avarəyəm*. M.V.Vidadi. *Ömrü olduqca sərgərdan dolandı; Hər saatı min il olub uzandı*. A.Səhhət. **Sərgərdan qalmaq** – əli hər şeydən çıxmaq, yersiz-yurdsuz qalmaq, işindən, yurdundan avara düşmək. *Baş tülək deyilsən, çolpa balasan; Sərgərdan qalarsan, tora düşərsən*. Aşıq Ələsgər. [Kəndli:] *..Biz 40 gün nə üçün avara, sərgərdan qalaq?* Qantəmir. **Sərgərdan qoymaq (eləmək)** – işdən-gücdən eləmək, işindən ayırıb avara qoymaq. *Bu dərdlər oyar məni; Al qana boyar məni; Ögeydən ana olmaz; Sərgərdan qoyar məni*. (Bayatı). *Bir nəzər qıl mənə, ey çeşmi-xumar; Eyləyibdir məni sərgərdan zülfün*. M.P.Vaqif. [Mirzə:] *Evi bərbad olmuş məni işimdən, gücümdən avara, sərgərdan eləyib, gətirib buraya*. Ə.Haqverdiyev.

**SƏRGƏRDANLIQ** *is.* Sərgərdan adamın halı, vəziyyəti; özündən asılı olmayaraq heç bir iş görə bilməmə, avara qalma. *Hicr sərgərdanlığın çərxi-fələkdən görməzəm; Bu cəfaları qılan ol yari-məhrudur mənə*. Xətayi. *Sərgərdanlığının üçüncü günü meşədə ona bir səs: – Dayan! – dedi*. Mir Cəlal.

**SƏRGİ** *is.* 1. Camaata göstərilmək üçün müəyyən qaydada qoyulmuş, ya asılmış şeylər və onların nümayiş etdirildiyi yer. *Rəsm sərgisi. Sənaye sərgisi. Xalça sərgisi*. – *O günün sabahı, iclasdan əvvəl qurultay binasında təşkil edilmiş kənd təsərrüfat sərgisini gəzərkən Eldar* [Ceyrana] *yaxınlaşır*. S.Hüseyn. [Lətifə:] *Rəssam Mehmanzadənin fərdi sərgisi idi*. M.Hüseyn. [Cavanşir bəy Bəhruza:] *Opera teatrının foyesində sizin sərginizi düzəltmək olar*. Ə.Məmmədxanlı.

2. Qurumaq üçün sərilmiş meyvə və s. // Bunların sərildiyi yer. *Baba bağın bir guşəsində mövcalan qayırardı ki, külək şiddətli əsəndə sərgini külək aparmasın*. H.Sarabski.

**SƏRGÜZƏŞT** *is.* [*fars.*] Birinin başına gələn hadisə, qəziyyə, əhvalat, macəra. *Başına gələn sərgüzəşti danışmaq*. – *Belə kiçik yaşda olan bir qızın nə kimi faciəli bir sərgüzəşti ola bilərdi*. S.Hüseyn. [Qaraca qızın] *başına gələn fəlakətlər, acı sərgüzəştlər daha çoxdur*. S.S.Axundov. *Mən Güneyqışlaqdan çıxandan bəri həyatımın bu kədərli sərgüzəşti haqqında kimsəyə bir söz deməmişəm*. İ.Əfəndiyev.

**SƏRHESAB** *sif.* [*fars.* sər və *ər.* hesab] Gözüaçıq, ayıq, sayıq. ◻ **Sərhesab olmaq** – ayıq olmaq, sayıq olmaq. [Şahmar bəy:] *..Gedin, görək, Allah nə istəyib, sərhesab olun, özünüzü gözləyin...* N.Vəzirov.

**SƏRHƏD** *is.* [*fars.* sər və *ər.* hədd] 1. Qonşu torpaqları, sahələri, ərazini bir-birindən ayıran xətt; mərz. *Avropa ilə Asiyanın sərhədi*.

// Qonşu dövlətlərin ərazisini, ya sularını biri-birindən ayıran xətt; hüdud. *Dövlət sərhədi. Su sərhədi. Sərhədi pozmaq. – Qoşunlarımız irəliləyib, Almaniya sərhədlərinə yaxınlaşırdılar.* M.Hüseyn. [Eldar:] *Biz sərhəd boyunda yaşayırıq, buralarda tez-tez qəribə və gözlənilməz hadisələr baş verir.* M.Rzaquluzadə.

2. *məc.* Yol verilən norma; hədd, hüdud. *Hər şeyin bir sərhədi olmalıdır. – Bəzən də heç bir sərhəd, heç bir məqam gözləməyən arvadı inandırmaq üçün çətin bəhsə girişməli olurdu.* B.Bayramov. ☐ **Sərhəd qoymaq** – son qoymaq, hədd qoymaq. **Sərhədi keçmək** – ədəb dairəsindən çıxmaq, cızığı keçmək, həddini aşmaq.

**SƏRHƏDÇİ** *is.* Dövlət sərhədini mühafizə edən, onu qoruyan əsgər. *Sərhədçi dəstəsi. Sərhədçilər marşı. – Burada sərhədin keşiyində duranlar yalnız rəsmi sərhədçilər deyil.* M.Rzaquluzadə.

**SƏRHƏNG** *is.* [*fars*] 1. Qoşun böyüyü, alay komandiri.

2. Polkovnik.

**SƏRXOŞ** *sif.* [*fars.*] İçmiş, kefli. *Sərxoş adam. – Yusif sərxoş* (z.) *halda, o tərəfə-bu tərəfə yırğalana-yırğalana gəlib çıxdı.* S.S.Axundov. ☐ **Sərxoş etmək (eyləmək)** – keflәndirmək, məst etmək. [Tərxan:] *Etdi sərxoş məni bu bircə qədəh.* A.Şaiq. **Sərxoş olmaq** – içib keflənmək. *Səməd artıq sərxoş olduğunu, bir az da dayansa bəlkə çox şeylər danışacağını hiss etdi.* İ.Hüseynov. // İs. mənasında. *Dəli sərxoşdan qorxar.* (Ata. sözü). // *klas.* Məc. mənada. *Əzizim, məzə sizdə; Mey sizdə, məzə sizdə; Mən sənin sərxoşunam; Meysiz də, məzəsiz də.* (Bayatı). // *klas.* Göz haqqında – xumar, süzgün. *Dəli könül, gör başına bir çarə; Gözü sərxoş, zülfü ilan gəlməmiş.* Q.Zakir.

◊ Sovet dövründə: **Sərxoşları ayıltma məntəqəsi** – sərxoşları ayıltmaq üçün tibb məntəqəsi.

**SƏRXOŞLUQ** *is.* 1. Sərxoş adamın halı; keflilik. *Çünki içmək onu xarab elədi, o qədər içirdi ki, bir saat da sərxoşluqdan ayıq olmurdu.* E.Sultanov. *Zeynal sərxoşluğundan müvazinətini saxlaya bilmədiyi üçün Mehribana gücü yetmirdi.* S.Hüseyn.

2. Daima içib keflənməyə adət etmə, içki düşkünlüyü. *Vaxtını sərxoşluqda keçirmək.*

**SƏRİH** *sif.* [*ər.*] 1. Açıqdan-açığa, aydınca.

2. Şəksiz-şübhəsiz.

**SƏRİLİ**[1] *zərf* Sərələnmiş halda (olan), yerdə sərili qalmış.

**SƏRİLİ**[2] *sif.* Sərilmiş. *Sərili paltar.*

**SƏRİLİ**[3] b a x **sarılı**. *Sübhdən axşamadək Səməd ağaca sərili çığırardı, bağırardı və ağzına gələni də qardaşına deyərdi.* Çəmənzəminli.

**SƏRİLMƏ**[1] "Sərilmək[1]"dən *f.is.*

**SƏRİLMƏ**[2] "Sərilmək[2]"dən *f.is.*

**SƏRİLMƏK**[1] *f.* 1. Əl və ayaqlarını açıb uzanmaq. *Divana sərilmək. Xalça üstünə sərilmək. – Qucağı uşaqlı arvadlardan bir neçəsi özündən gedib, qarın üstünə sərilmişdi.* Çəmənzəminli. *Hər ikisi yumşaq otların üzərinə sərildilər.* H.Nəzərli. // Yerə dəymək, yıxılmaq. *Yazıq Məşədi Teymur yerə dəyib çul kimi sərildi.* Ə.Haqverdiyev. *Məsmə ..* [Seyidi] *bütün qüvvətilə özündən o tərəfə itələyir. Kor Seyid üzü üstə yerə sərilir.* S.Hüseyn. // Düşüb qalmaq, yıxılıb qalmaq. *Yaxınlaşanda* [İmamverdi] *gördü ki, bir uşaq hərəkətsiz yerə sərilibdir.* S.S.Axundov.

2. *məch.* Salınmaq, döşənmək. *Usta Ağabala... pəncərənin qabağında sərilmiş* (f.sif.) *fitələr üstə hənalanıb yatmış iki kişini süzdü.* Çəmənzəminli. *Sobanın yanında Tellinin yatağı sərilmişdi.* S.Hüseyn.

3. *məch.* Qurumaq üçün ip, məftil, ağac və s. üzərinə salınmaq, asılmaq.

**SƏRİLMƏK**[2] b a x **sarınmaq**. *Qaraqaş tilsimli qılıncnan əjdahanı quyruğunnan yaraladı. Əjdaha dönüb sərildi Qaraqaşa.* (Nağıl). *Mahmud ağacın kötüyünə sərilmiş* (f.sif.) *yekə bir ilan gördü.* S.Vəliyev.

**SƏRİMƏ** "Sərimək"dən *f.is.*

**SƏRİMƏK** *f.* 1. B a x **sarımaq** 2-ci mənada. *Əlini sərimək. Belini sərimək. – Kazımın başını səriyib bir tərəfə yıxmışdılar.* Çəmənzəminli. *..Musa kişi keçə papağını başına basdı. Yun şərfini boğazına səridi.* M.İbrahimov.

2. B a x **sarımaq** 4-cü mənada. *Məşədi Kazım ağa təəccüblə gözlərimin içinə baxaraq dedi: – Deyəsən, axı məni sərimisiniz?* M.S.Ordubadi.

**SƏRİN** *sif.* 1. Az soyuq, ilıq ilə soyuq arası. *Sərin hava. Sərin su. Sərin çeşmə. Sərin meh.*

– *İtlər, çobanlar meşələrə, sərin kölgələrə çəkilmişdilər.* A.Şaiq. *Sərin çeşmələrin qaynayır gözü; Yenə dinləyirəm aram-aram mən.* N.Xəzri. // *is.* Sərin hava, sərin yer. *Sərində oturmaq. Sərində yola düşərik. Sərinə çəkilmək. – ..Ətəyindən tutmuş və axşam sərinində titrəşən körpələr bir az da* [Səriyyə xalaya] *qısıldılar.* M.İbrahimov. ☐ **Sərin düşmək** – hava bir qədər soyumaq, sərinləşmək. *Axşamlar sərin düşəndə əhali küçələrə tökülür.* M.İbrahimov.

2. *məc.* Arası soyuq, incik, incimiş. *Əzizim, nə dərindi; Dəryalar nə dərindi; Mən yara nə dedim ki; O mənimlə sərindi?* (Bayatı). *Yarpız isə çox sərin* (z.) *və etinasız cavab verirdi.* Mir Cəlal.

◊ **Sərin baxmaq** – laqeyd olmaq, ürəyi yanmamaq, vecinə gəlməmək. *Yad yığılıb sərin baxar, ağlamaz; Qərib öldüm, bikəs öldüm, ad öldüm.* M.V.Vidadi. **Ürəyini sərin saxlamaq** – b a x **ürəyinə sərin su səpmək**.

**SƏRİNCƏ** *sif.* Bir az sərin, az sərin, bir az soyuq. *Sərincə bir axşam. Sərincə yer tapıb oturmaq. – Evinin qabaq tərəfi eniş dağdır, dal tərəfi şəhərə baxır. Həmə vaxt sərincə yel əsər.* N.Vəzirov.

**SƏRİNKEŞ** *is.* Otaqda, binada sərinlik yaratmaq üçün cihaz, qurğu; ventilyator. *Sərinkeş bayırdan havanı çəkib süzgəcdən keçirərək soyudur, sonra isə ventilyator havanı otağa verir.*

**SƏRİNLƏDİCİ** *sif.* Sərinlik verən; soyuq. *Sərinlədici içkilər.*

**SƏRİNLƏMƏ** "Sərinləmək"dən *f.is.*

**SƏRİNLƏMƏK** 1. *f.* Sərin olmaq, sərin düşmək. *Axşamüstü hava sərinlədi.*

2. B a x **sərinlənmək**. [Nuriyyə:] *Mən arxın büllur kimi duru suyu ilə üzümü yuyub sərinlədim.* İ.Əfəndiyev. *Dərədə işləyənlər üçün isti olsa da, məktəb həyətində quyuqazanlar arabir əsən küləkdən sərinləyirdilər.* Ə.Vəliyev.

**SƏRİNLƏNMƏ** "Sərinlənmək"dən *f.is.*

**SƏRİNLƏNMƏK** *məch.* Sərində oturmaq, yaxud sərin su içmək, sərin su ilə yuyunmaq və s. ilə özünü sərinlətmək, hərarətini azaltmaq. *Balkonda oturub sərinləndim. Soyuq su içib sərinləndim.* – [Şiraslan düşünürdü] *..hər çeşmədən yüz-yüz maşının min-min sərnişini yayın isti, qızmar günlərində bu sudan* [turş sulardan] *içib sərinlənərsə, .. bizim işçi adamlar üçün nə qədər də xeyirli bir iş görülmüş olar.* S.Rəhimov. *Pəncərəmi döyür çinar; Deyir çinar: – Çıx sərinlən kölgəmdə sən.* N.Xəzri. // Sərin olmaq, sərin düşmək. *Cığır aşağıya günəş şüaları buraxmayan bu göyçək əzəmətli ağacların arası ilə keçib dik yuxarı dırmandıqca meşə kölgələnib sərinlənirdi.* Ə.Əbülhəsən.

**SƏRİNLƏŞDİRİCİ** *sif.* Sərinlik yaratmaq, sərin etmək üçün işlədilən. *Sərinləşdirici içkilər.*

**SƏRİNLƏŞDİRMƏ** "Sərinləşdirmək"dən *f.is.*

**SƏRİNLƏŞDİRMƏK** b a x **sərinlətmək**.

**SƏRİNLƏŞMƏ** "Sərinləşmək"dən *f.is.*

**SƏRİNLƏŞMƏK** 1. B a x **sərinləmək**. [Pəri Cadu:] *Sən də get içəri, su töksünlər, əl-üzünü yu, bir az sərinləş.* Ə.Haqverdiyev. *Sərinləşən* (f.sif.) *havada nəfəs almaq istəyənlər dəniz qırağına doğru axışmağa başlamışdılar.* M.Hüseyn.

2. *məc.* Münasibətlərində sərinlik, soyuqluq əmələ gəlmək.

**SƏRİNLƏTMƏ** "Sərinlətmək"dən *f.is.*

**SƏRİNLƏTMƏK** *f.* 1. Sərin etmək, sərinləşdirmək. *Yağış havanı sərinlətdi.* – [Ağaclar] *qəsrin alçaq hasarının dibində bitdikləri üçün qəsrin həyətini sərinlətmək vəzifəsini bitirirdi.* M.S.Ordubadi. *Təmiz hava yataq otağına dolub qızı sərinlətdi.* Ə.Vəliyev.

2. *məc.* Təskin etmək, təskinlik vermək, təsəlli verərək fərəhləndirmək. *Sərinlətdin baxışınla könlümü; Buludların uçuşundan yarandın.* Ə.Cavad. *Vaxtsız qovlamayın siz məhəbbəti; Ürək sərinlədir eşqin şərbəti.* S.Vurğun.

**SƏRİNLİK** *is.* 1. Sərin hava. *Sərinlik düşmək. – Bir az əvvəl yağmış yağışdan sonra havada sərinlik və rütubət hiss olunurdu.* T.Ş.Simurq. *Dənizdən əsən xəfif meh fəhlə qəsəbəsinə xoş bir sərinlik gətirirdi.* M.Hüseyn.

2. Sərin yer. *Sərinlikdə oturmaq. – ..Hava sərinlikdən xoş bir ətir gətirirdi.* Mir Cəlal. [Yarpaqlar] *..sərinlik yaradır.* Ə.Əbülhəsən.

3. Sərin şeyin halı. *Suyun, havanın sərinliyi.*

4. *məc.* Münasibətdə soyuqluq. *Ancaq son zamanlarda Mürsəl ilə mənim aramdakı bu sərinlik birdən-birə gözlənilmədən çəkildi.* Mir Cəlal.

**SƏRİŞTƏ** *is.* [*fars.*] Bir işə bələdlik, bir işi bacarma; təcrübə, bacarıq. *Bağ işlərində səriştəm yoxdur. Ovçuluqda səriştəsi var.* – [Sadıq kişinin övrəti ərinə:] *Qaç tez usta Hüseynin yanına, onun həkimlikdə səriştəsi çoxdu*. C.Məmmədquluzadə.

**SƏRİŞTƏLİ** *sif.* Səriştəsi, bacarığı, təcrübəsi olan, bir işə bələd olan. *Əkinçilikdə səriştəli aqronom. Dülgərlikdə səriştəli adam.*

**SƏRİŞTƏSİZ** *sif.* Bir işdə səriştəsi, bacarığı, təcrübəsi olmayan, bir işə bələd olmayan. *Səriştəsiz adam.*

**SƏRKEŞ** [*fars.*] b a x **dikbaş**.

**SƏRKƏRDƏ** *is.* [*fars.*] Böyük qoşun birləşmələrinin başçısı; komandan. *Əyinlərinə dəmir geyim geymiş sərkərdələr öz dəstələri ilə bərabər küçələrə çıxmışdılar*. M.S.Ordubadi.

**SƏRKƏRDƏLİK** *is.* Sərkərdə vəzifəsi, böyük qoşun hissələrinə başçılıq etmə; komandanlıq. *Bu möhtəşəm qalanı hədələyən orduların ən böyüyünə o, sərkərdəlik etmişdir*. M.Hüseyn.

**SƏRKİ** *is.* Tənə, qaxınc, töhmət, məzəmmət, danlaq. *Özüm də bilmirəm, nədir günahım; Başıma yer-yerdən sərkilər yağır.* S.Rüstəm.

◊ **(Başına) sərki vurmaq** – etdiyi yaxşılığı üzə vurmaq, tənə etmək, başına vurmaq. [Gültəkin:] *Neçin siz həmişə mənim başıma sərki vurursunuz?* C.Cabbarlı.

**SƏRLÖVHƏ** *is.* [*fars.* sər və *ər.* lövhə] Əsərin və ya qəzetin başda yazılan qısa adı; məqalənin adı; başlıq. *Birinci hissənin sərlövhəsi. Məqalənin sərlövhəsi. Dastanın sərlövhəsi. – Məktubun sərlövhəsi* “*Vətənimizin sədaqətli oğlu Nuriyev yoldaşa*” *deyə başlayırdı*. Ə.Vəliyev. *Görən nə düşündü, görən nə andı; Oxucum görüncə bu sərlövhəni*. B.Vahabzadə.

**SƏRLÖVHƏLİ** *sif.* Sərlövhəsi olan, sərlövhə qoyulmuş. *Sərlövhəli məktub. – Bu şeir Lermontovun* “*Mələk*” *sərlövhəli mənzuməsinə nəzirədir, – dedim.* T.Ş.Simurq.

**SƏRMAYƏ** *is.* [*fars.*] Bir şey üçün qoyulan və ya lazım olan pul, maya; kapital. [Hacı Fərəc:] *..Həmin o sərmayədir məni dəli-divanə eyləyən.* N.Vəzirov. [Yusifəli Mahmuda:] *Mənə də bir sərmayə lazımdır ki, başımı dolandırım*. P.Makulu.

**SƏRMAYƏÇİ** *is.* və *sif.* Sərmayəsi olan, varlı, dövlətli; kapitalist.

**SƏRMAYƏÇİLİK** *is.* Sərmayə sahibliyi; varlılıq, dövlətlilik. [Mahmud bəy:] *Hacı! Belə müsibətlərə bais sərmayə və sərmayəçilikdir*. N.Vəzirov.

**SƏRMAYƏDAR** [*fars.*] b a x **sərmayəçi**.

**SƏRMAYƏDARLIQ** b a x **sərmayəçilik**.

**SƏRMƏ** “Sərmək”dən *f.is.*

**SƏRMƏK** *f.* 1. Bir şeyi qurumaq üçün ip və s. üzərinə salmaq. *Xalçaları yuyub sərmək. – Qız anasının yuduğu paltarları sərmək üçün dam üstünə çıxmışdı.* Ə.Məmmədxanlı. // Qurutmaq üçün meyvəni və s.-ni bir şeyin üzərinə nazik qat şəklində tökmək, yaymaq. *Nanəni süfrə üstünə sərmək. – Qızılgülü dərəsən; Yaylıq üstə sərəsən; Yerin mənə nişan ver; At göndərim gələsən*. (Bayatı). *..Vəliqulu əynində cındır gödək arxalıq və başında köhnə boz papaq kürəklə peyin sərirdi*. C.Məmmədquluzadə.

2. Bükülmüş, lülələnmiş, qatlanmış bir şeyi açılmış hala gətirmək. *Mühəndis Haqverdizadə xəritəni götürüb bir də yerə sərdi və axtarıb burada olan Göy qayanı yoxladı.* S.Rəhimov. *Müdir girdələnib bükülmüş qəzeti şkafın üstündən götürüb stolun üstünə sərdi*. M.İbrahimov.

3. Döşəmək, salmaq. *Palazı balkona sərmək. Xalçanı evin yerinə sərmək.*

4. Yerə yıxmaq, vurub salmaq. *Dünyaya səs saldı öz səsilə o; O sərdi torpağa qanlı düşməni*. N.Xəzri.

5. Bükmək, sarımaq. *Bəyaz-bəyaz vərəqlərə sərdik səni, ağ çiçək!* N.Xəzri.

◊ **Yatağa (yerə) sərmək** – xəstə salmaq, yatağa düşməsinə səbəb olmaq, yorğan-döşəyə salmaq. *Heç bir xəstəlik bu vaxta qədər* [Arazı] *yatağa sərməmişdi*. A.Şaiq. *Şirəkeşlik yazıq kişini cavan yaşında yerə sərmiş və üç balasını yetim qoymuşdu.* Ə.Sadıq.

**SƏRNİC** *is.* [*fars.*] Misdən, saxsıdan və s.-dən qayrılmış ağzıgen bir və ya iki dəstəli

qab. *Sərnic dolu süd. Sərnici yağla doldurmaq. – Böyüklər mis güyüm, cürdək, vedrə, sərnic götürmüşdü.* Ə.Vəliyev. *Xalisə arvad ağ mis sərnici dizləri arasında tutaraq inək sağır*. İ.Əfəndiyev.

**SƏRNİŞİN** *is.* [*fars.*] 1. *köhn.* Yuxarı başda əyləşən.

2. Müxtəlif nəqliyyat vasitələrində hərəkət edən insanlar. *Getdikcə vaqonda sərnişin çoxalırdı*. S.Rəhman. // [Bəhram] *Reyhanı sərnişin qatarına əyləşdirdi, cibinə beş yüz manat da pul qoyub yola saldı.* Mir Cəlal.

**SƏRPAYI** *is.* [*fars.*] *köhn.* Böyük məclisi, toyu və s.-ni idarə edən adam; ayaqüstü. *Məclisin sərpayısı. – Toy gecələrini idarə edənə sərpayı deyərdilər.* H.Sarabski.

**SƏRPAYILIQ** *is. köhn.* Toyda, məclisdə və s.-də qonaqlara xidmət etmə; ayaqüstü. *Məclisdə sərpayılıq etmək.*

**SƏRPMƏK** *f.* Bədəndə yumşaq toxumaların zədələnməsi; yıxılmaq, dartınmaq.

**SƏRPUŞ** *is.* [*fars.*] 1. *köhn.* Baş örtüyü, örtük. *Gəncin sərpuşu niqab qarışıq* [Beyrəyin] *qoltuğunda qaldı*. M.Rzaquluzadə.

2. Soyumamaq üçün xörək çəkilmiş qabın üstünə qoyulan kasayaoxşar mis qab; qalpaq. *Plovun üstündə də bir mis sərpuş, yanında da bir boşqabın içində üstü qatıqlı dörd yarpaq dolması qoyulardı.* H.Sarabski.

**SƏRRAC** *is.* [*ər.*] Yəhər və sair qoşqu ləvazimatı qayırıb satan adam. [Bir kişi:] *Yoldaşımın adı Məşədi Səttardır. Şuşada sərrac dükanı var.* Ə.Haqverdiyev. *Qafqaz şəhərlərinin birində Usta Zeynal adlı bir sərrac öz arvadı Şərəfnisə ilə yaşayırdı*. S.S.Axundov. // Dəridən müxtəlif məmulat hazırlayan usta.

**SƏRRACLIQ** *is.* Sərrac işi, sərrac peşəsi, sənəti. *Usta Zeynal sərraclıq etməklə külfətini bir tövr dolandırırdı*. S.S.Axundov. // Dəridən müxtəlif şeylər hazırlayan.

**SƏRRAF** *is.* [*ər.*] 1. Müəyyən faizlə pul dəyişməklə məşğul olan (adam). *..Kağızlarını yoxladığım zaman sərrafların yanında yüz min tümən əmanət pul qoyulduğunu gördüm.* M.S.Ordubadi. [Səttar] *sonra baratı dəyişmək üçün yaxındakı sərraf dükanlarının birinə tərəf getdi*. P.Makulu.

2. *məc.* Tez başa düşən, tanıyan, bilən; arif. *Adam sərrafı* (*adamtanıyan*). *Söz sərrafı* (*sözləri yaxşı bilib yerində işlətməyi bacaran adam*). *– El gözü sərrafdır*. (Ata. sözü). *Aşıq gözü sərraf olar, bircə dəfə baxmaqla adamları saf-çürük eləyər.* "Koroğlu". *Bu qoşmalar, Azərbaycan aşıq ədəbiyyatının klassiki sayılan Qurbani, Aşıq Abbas Tufarqanlı, Şəmşirli Aşıq Hüseyn, Aşıq Ələsgər kimi söz sərraflarının inciləri ilə yanaşı durur*. M.İbrahimov.

**SƏRRAFLIQ** *is.* Sərraf (1-ci mənada) işi, peşəsi, sənəti. [Hacı Rəcəbəli:] *Bu qəzvinli Şeydadır ki, gündüz sərraflıq elər, gecə əyyarlıq.* M.F.Axundzadə.

**SƏRRAST** *sif.* və *zərf* [*fars.*] 1. Duz, düzgün, dəqiq, hədəfi düz vuran. *Sərrast atıcı. Gülləni sərrast atmaq. – Düşmən dərhal bizim sərrast top atəşimizin altına düşdü.* Ə.Əbülhəsən. *Belə müştərək ovun yaxşı cəhəti odur ki, bir neçə ovçudan hər halda biri sərrast atacaq..* M.Rzaquluzadə.

2. *məc.* Düzgün, doğru, dəqiq, səlis, tutarlı. *Gülşənin sözləri, sərrast danışığı Qorxmaz İlyasovun çox xoşuna gəldi.* Ə.Vəliyev.

**SƏRRASTCA** *zərf* Sərrast, düz, birbaşa. [Əsgər:] *Hər halda bu top güllələrindən sərrastca gedib zabit qazmasına da düşəni olub.* Ə.Əbülhəsən.

**SƏRRASTLIQ** *is.* 1. Sərrast şeyin halı.

2. Düzgünlük, mütənasiblik (bədəndə), təndürüstlük. *..Qızın sifətindəki mərdanə gözəllik, sərrastlığı, ..danışığındakı cazibə ..* [Səlimin] *gözündən qaçmamışdı.* B.Bayramov.

**SƏR-SAHMAN** *is.* Səliqə, qayda, nizam. *Üst-başını sər-sahmana salmaq. Otaqda sər-sahman yaratmaq. – Şəhərdə sakin olduqdan sonra Nurcahan xala evin sər-sahmanı ilə məşğul olardı.* H.Sarabski.

**SƏRSƏM** *sif.* [*fars.*] Ağlını itirmiş, zehni qarışmış, fikri azmış. [Kabla Türbət:] *Cənab həkim, mən bu dəli, sərsəm Heydərin atabir, anabir qardaşıyam.* C.Məmmədquluzadə. *Axırı Şaban sərsəm halətinə gəldi.* Ə.Haqverdiyev. □ **Sərsəm eyləmək** – dəli eləmək, ağlını əlindən almaq. *Abad qaşın xəyali ilə sərsəm eyləyib; Mehrab içində bir bax onun guftügusuna*. S.Ə.Şirvani. **Sərsəm olmaq** – ağlını itirmək, dəli olmaq, başı xarab olmaq, fikrini azdırmaq. [Göyçək:] *..Bəhanə gətirdi ki, ..sərsəm olmuşam*. Ə.Əbülhəsən.

**SƏRSƏMLƏMƏ** "Sərsəmləmək"dən *f.is.*

**SƏRSƏMLƏMƏK** *f.* Hər hansı bir səbəbdən ağlını itirmək, gicəlmək, dəli kimi olmaq, zehni qarışmaq. [Şabanın] *sərsəmləyən* (f.sif.) *vaxtda dilindən Gülsüm adı bilmərrə düşmürdü*. Ə.Haqverdiyev.

**SƏRSƏMLİK** *is.* Sərsəm hal və vəziyyət və ya sərsəmcəsinə iş, hərəkət; dəlilik, ağılsızlıq. [Musa:] *Fəqət ilanı öldürüb də yavrusunu buraxmaq sərsəmlik deyilmi ... ya?* H.Cavid. *Qızın elçisiz, sorğusuz-sualsız qoşulub gəlməsi sərsəmlikdir, ağılsızlıqdır*. M.İbrahimov.

**SƏRSƏR** *is.* [*ər.*] Güclü və soyuq külək.

**SƏRSƏRƏ** b a x **dənlik** 2-ci mənada.

**SƏRSƏRİ** *sif.* [*fars.*] 1. İşi-gücü və müəyyən yeri olmayıb orada-burada dolaşan, heç bir işlə məşğul olmayan; avara, veyil. [Zeynalı] *belə sərsəri həyata kefdən .. ayılmayan bəzi arqadaşları .. sürükləmişdi*. S.Hüseyn. // İs. mənasında. *Dəyibdir Zakirə eşqin əsəri; Kimi dəli deyir, kimi sərsəri*. Q.Zakir. [Fərhad Sitarəyə:] *Sən Nəsrəddin şahın hərəmi, mən səfalət içində çapalayan bir sərsəri, elə deyilmi?* C.Cabbarlı.

2. *zərf* Sərsəricəsinə, dəlicəsinə. *Tamam içəridən çıxır və sərsəri, qorxunc bir qəhqəhə çəkərək ildırım kimi çaya tərəf qaçır*. S.S.Axundov. ☐ **Sərsəri olmaq** – dəli olmaq, ağlını itirmək. *Aşığınam canü dildən, ey pəri! Dərdi-fərağından oldum sərsəri*. Aşıq Pəri.

3. Sahibsiz, yersiz-yurdsuz, avara. [Səfil uşaq] *gündüz diləndiyi bir parça çörəyi şəhərin sərsəri itlərinə paylayırdı*. Ə.Məmmədxanlı.

**SƏRSƏRİLİK** *is.* Sərsəri adamın halı; avaralıq, veyillik. *Sərsərilik etmək*.

**SƏRT** *sif.* 1. Bərk, möhkəm. *Sərt daş. – Bu vaxt yaxında, sərt qayaların dalında insan gülüşləri, külüng və motor səsləri eşidildi*. Z.Xəlil.

2. Şiddətli, kəskin (*yumşaq, mülayim* ziddi). *Sərt iqlim. Sərt soyuq. Sərt şaxta. Sərt külək. – Əlimizi aparardı sərt ayaz; Ruzimiz olurdu gündən-günə az.* Aşıq Ələsgər. [Seyfəli] *aranın .. istisindən çıxıb yaylağın sərt soyuq havasına düşdüyü üçün üşüyüb acı alma kimi büzüşmüşdü.* B.Bayramov. // Zərf mənasında. *Ellərə car çəkən payızın səsi; Düzlərdə sərt əsən küləklərdədir.* N.Xəzri.

3. *məc.* Qaba, kobud, tünd, kəskin. *Sərt adam. Sərt xasiyyət. – Rüstəm kişi Səkinəyə sərt bir cavab verdi*. M.İbrahimov. *Yaxşı, daha niyə belə lüt-üryan dayanmısan qabağımda, geyin gedək! – deyə, Sultan qardaşı oğlunu sərt nəzərlə süzdü*. İ.Hüseynov.

4. Cod, yumşaq olmayan. *Sərt tük. Sərt yun. Sərt parça*.

**SƏRTLƏŞMƏ** "Sərtləşmək"dən *f.is.*

**SƏRTLƏŞMƏK** *f.* 1. Getdikcə yumşaqlığı, mülayimliyi azalmaq, kəskinləşmək, daha da sərt olmaq, daha da şiddətlənmək, qatılaşmaq. *Hava daha da sərtləşir, külək daha da gücləşirdi.* C.Cabbarlı. *Külək gah mülayim əsir, gah sərtləşir*. R.Rza.

2. *məc.* Qabalaşmaq, kobudlaşmaq, kəskinləşmək. *Xasiyyəti sərtləşmək. – Ağa Murad bəyin Reyhan xanımla rəftarı .. get-gedə sərtləşirdi*. T.Ş.Simurq. *Xəlil, deyəsən, katibin niyyətini duyub, birdən sərtləşdi*. M.Hüseyn.

3. Ciddi, sərt görkəm almaq, sərtlik ifadə etmək. *Üzü sərtləşmək. – Səlimin gözləri də Kərimin gözləri kimi sərtləşdi*. S.Rəhimov. *Səmədin sifəti sərtləşdi*. İ.Hüseynov.

**SƏRTLİK** *is.* 1. Sərt şeyin halı, keyfiyyəti; bərklik, möhkəmlik. *Qayanın sərtliyi*.

2. *məc.* Xasiyyətdə tündlük, tündməzaclıq, kəskinlik. *Əsgər özünü yığışdırdı. O, Dəmirovun yumşaqlığı içərisində olan sərtliyini də yaxşı anlamışdı*. S.Rəhimov. [Vahid:] *Anamdakı sərtlik də, qəzəb də yavaş-yavaş azalmağa başladı*. B.Bayramov. // Sərt hərəkət, sərt rəftar. *Sərtlik göstərmək*.

3. *məc.* Möhkəmlik, səbat, mətanət, ciddilik, sarsılmazlıq. [Ataşın] *gözlərindəki məna, üzündəki sərtlik, duruşundakı vüqar əsil kişilik xüsusiyyətləri idi.* Ə.Vəliyev. *..Bununla belə əsgərlərin hamısının simasında bir sərtlik, gözlərində bir qətiyyət duyulurdu.* Ə.Əbülhəsən.

**SƏRV** *is.* [*fars.*] 1. *bot.* Cənubda bitən iynəyarpaqlı, həmişəyaşıl ağac. *Sərv 20-25 metr hündürlükdə, iynəyarpaqlı, həmişəyaşıl ağacdır. İynə yarpaqları pulcuqşəkillidir.* H.Qədirov. *Axşamlar* [Afaq] *şairlə bərabər bağçadakı qoşa sərv ağacları altında oturar, xəyalı şairin xəyalına qoşulub gələcəyə doğru uçardı*. Ə.Məmmədxanlı.

2. *məc.* Klassik şeirdə: gözəlin qaməti bu ağaca oxşadılır. *Vey sərv, nə xoş canalıcı qəmzələrin var; Həm şivələrin var!* M.Ə.Sabir. [Mərsiyəxan qadına:] *Bu sərv qamət, bu cazibəli gözlər, siyah danə... Bunlar röyamı?* Çəmənzəminli.

**SƏRVAXT** *sif.* və *zərf* [*fars.* sər və *ər.* vəqt] Sayıq, gözüaçıq, ehtiyatlı, ayıq. *Sərvaxt olmaq.* – [Adilin] *hər işində, hətta gülüşündə və zarafatında belə ciddi, sərvaxt bir ağılın hakim sürdüyü duyulurdu.* İ.Əfəndiyev. *Fərid relslər arasında addımlayır tək; Gərək burda sərvaxt ola yol gözətçisi.* Ə.Kürçaylı.

**SƏRVAXTLIQ** *is.* Sərvaxt olma, ehtiyatlılıq, gözüaçıqlıq, ayıqlıq, sayıqlıq. *Sərvaxtlıqdan söhbət gedəndə Paşa bəy bir neçə dəfə Xalıqverdinin adını çəkdi.* Ə.Vəliyev.

**SƏRVBOY(LU)** *sif. şair.* Sərv kimi boyu olan, uca və zərif qamətli. *Hüsnünü yad eyləsəm, ey sərvboylu dilbərim; Firqətindən çeşmətək axar gözümdən yaşlar.* Xətayi. // İs. mənasında. *Dolan, sərvboylum, dolan; Sənsən məni eşqə salan.* Aşıq Bəylər.

**SƏRVƏR** *is.* [*fars.*] *klas.* Başçı, rəis, rəhbər. // Məc. mənada. *Mən şaham, ey gözəllərin sərvəri; Qurbanam Vaqif tək qul ilən sənə!* M.P.Vaqif. *O sərvəri-xuban, o şahisənəm; Mübarək əlilə etməsə məlhəm; Gözümün qan yaşı qurumaz bir dəm; Oxu sınıb dildə qalan gəlməmiş.* Q.Zakir.

**SƏRVƏT** *is.* [*ər.*] 1. Var, dövlət. *Böyük sərvət və mülk sahibi Hacı Kərim iki gün əvvəl vəfat etmişdi.* Çəmənzəminli. *Hacının sərvəti haqqında növbənöv hekayətlər söylənirdi və onun banklarda olan pulunun qədərini milyon hesab edirdilər.* Ə.Haqverdiyev.

2. Maddi nemətlər. [Yaşar:] *Biz təsərrüfatı maşınlaşdırmaqla təbiətin əlində olan bütün sərvəti ancaq sinifsiz cəmiyyətin ixtiyarına verməliyik.* C.Cabbarlı. *Şairin vətənindən hər yana, dünyanın hər yerinə axan sərvət aşıbdaşırdı.* Mir Cəlal. // *məc.* Hər hansı baxımdan yüksək qiyməti və əhəmiyyəti olan şey, hadisə. *Musiqi sərvəti. Dil sərvətimizdir.*

**SƏRVƏTDAR** *f.* [*ər.* sərvət və *fars.* ...dar] Sərvət sahibi olan adam; kapitalist, dövlətli, varlı. *Kluba və bələdiyyəyə üzv olmaq sərvətdarlar arasında da böyük bir şərəf sayılırdı.* A.Şaiq. *Birdən eşidir ki, filan kənddə filan sərvətdar mərhum olubdur.* Ə.Haqverdiyev.

**SƏRVƏTLƏNMƏ** "Sərvətlənmək"dən *f.is.*

**SƏRVƏTLƏNMƏK** *f.* Sərvət sahibi olmaq, sərvətə malik olmaq, sərvətli olmaq; varlanmaq.

**SƏRVƏTLİ** *sif.* və *is.* Sərvəti olan, dövlətli, varlı, sərvətdar. *Sərvətli adam.* – *Ətrafdan həyəcanlı səslər gəlirdi; sərvətlilər qızıllarını basdırırdılar, fəqirlər də damlara doluşub "Allah" sədasını göyə qovzayırdılar.* Çəmənzəminli. // Zəngin. *Gündüz baxdım göy dənizə dedim: nə çox suyun var; Dedi: məndən sərvətlidir yurdundakı buruqlar.* R.Rza.

**SƏRVQAMƏT(Lİ), SƏRVQƏD(Lİ)** bax **sərvboy(lu)**. *Getdi başından, könül, ol sərvqəddin sayəsi; Ağla kim, idbarə təbdil oldu iqbalın sənin.* Füzuli.

**SƏRVLİK** *is.* Sərv ağacları bitmiş yer, sərv ağacları əkilmiş yer. *O səhra ki başdan-başa tikandı, qumdu; Döndü sərin kölgə salan sərvliklərə.* Ə.Cəmil.

**SƏRZƏNİŞ** *is.* [*fars.*] 1. Qaxınc, danlaq, tənə, məzəmmət; başa qaxma. *Məmməd bəy Ağabəyimin sərzənişinin mənasını anladı.* Çəmənzəminli. [Arif:] *Artıq yetişir bu sərzənişlər; Əfv eylə, qüsurə baxma, Xavər!* H.Cavid. ☐ **Sərzəniş etmək** – danlamaq, tənə etmək, məzəmmətləmək. [Əmiri-topxanə:] *Yəqinimdir ki, bu söz Bağır xana əsər edəcək, çünki dünən səlami-ammdə şah ona qəzəbnak olub sərzəniş edibdir ki, çaxır içib, məst olub, namaz qılmağa məscidə daxil olubdur.* M.F.Axundzadə.

2. **Sərzənişlə** şəklində *zərf* – töhmətlə, tənə ilə, məzəmmətlə. [Yaşlı kişi:] *Başını sərzənişlə bulayıb, Şirinnaz töhmətedici bir baxışla mənə baxdı.* S.Hüseyn. *Bülənd üzünü döndərib sərzənişlə qıza göz yetirdi.* Ə.Əbülhəsən.

**SƏS** *is.* 1. Qulağa gələn, eşidilən səda; eşitmə orqanının qavradığı şey; ün, səda. *Uzaqdan səs gəlir. Zurna səsi. Top səsi.* – *Həyətdə Cəfər əminin fiti və tənbəl-tənbəl atılan addımlarının səsi eşidilirdi.* H.Nəzərli. // Danışma, oxuma, qışqırma və s. zamanı səs tellərinin titrəməsindən hasil olan və ucalığı, səslənməsi ilə fərqlənən səda. *Nazik səs. Səsini ucaltmaq. Səsindən tanımaq. Yanıqlı*

*səs. – Salam, yoldaş katib, icazə verin, əlinizi sıxım, – deyə, kim isə xoş bir səslə daldan Şirzada müraciət etdi.* M.İbrahimov. *Sonra qızın dizlərinin heyi kəsildi, yıxılmamaq üçün ovçunun qoluna söykəndi, zəif bir səslə yalnız: – Məni evə apar, laçınım, – dedi.* Ə.Məmmədxanlı. ☐ **Səsi batmaq** – hər hansı bir səbəbə görə səsi tutulmaq, eşidilməz olmaq. [Fərhad bəyin] *ağzı qurumuş, səsi batmışdı.* Qantəmir. *Elə bil birdən səsim batdı.* Ə.Məmmədxanlı.

2. Səs tellərinin müğənnilik (vokal) qabiliyyətini göstərən səslənmə dərəcəsi. *Zil səs. Gur səs. Səsini yoxlamaq.* – [Xədicə] *..mahnı oxuyub səsini mənə eşitdirirdi.* S.Hüseyn.

3. Bəzi cansız şeylərin çıxardığı və onlar üçün səciyyəvi olan səda. *Küləyin səsi. Selin səsi. Dalğaların səsi. – Quşların nəğməsi, suların səsi; İnsandan uzaq olmasaydı əgər.* M.Dilbazi. [Məzlum] *radioqəbuledici cihazın səsini aldı.* S.Vəliyev.

4. *fiz.* Hava və ya başqa mühit zərrəciklərinin titrəyiş hərəkəti. *Səs nəzəriyyəsi. Səs sürəti. Akustikanın səs bəhsi.*

5. *dilç.* İnsan nitqinin aydın dərk edilən elementi; sövt. *Burun səsləri. Diş səsləri.*

6. *məc.* Gurultu, patıltı; gurultu-patıltı; səs-səda. *Səsi sonra çıxacaq.* ☐ **Səs qopmaq (düşmək)** – şayiə yayılmaq, xəbər yayılmaq, gurultu qopmaq. *İkindi çağı idi. Obada "Dursunu ayı basmış" deyə səs qopdu.* A.Şaiq. *Kəndə səs düşdü.* R.Rza.

7. *məc.* Mülahizə, rəy, mühakimə, fikir. *Kütlənin səsi. Xalqın səsinə qulaq asmaq.*

8. Dövlət və ictimai idarələrdə hər hansı bir məsələnin həllində öz fikrini bildirmək hüququ. *Həlledici səs. Məşvərətçi səs.* ☐ **Səs vermək** – 1) çağırışa cavab vermək, hay vermək. *Eşidir, amma səs vermir. – Gəlirəm, anacan, – deyə, qız yuxarıdan anasına səs verir.* Ə.Məmmədxanlı; 2) seçki zamanı bir məsələni, işi həll edərkən səsvermədə iştirak etmək, səsini bu və ya başqa adamın və ya bir işin lehinə vermək. *Döyüşdə sınanmış mərd əsər kimi; Ellər vəhdətinə səs verək bu gün.* M.Rahim. **Səsə qoymaq** – bir məsələnin və ya bir namizədin nə dərəcədə məqbul olub-olmadığını səsvermə yolu ilə müəyyən etmək. *Yenə bir neçə yerdən səs gəldi ki, gündəlik təsdiq olunsun. Buna baxmayaraq, Nəcəf demokratiyanı gözləyərək səsə qoydu.* M.İbrahimov. *Şəhərli gənc, Xanlar Qasımoğlunun sədr olmasını səsə qoydu.* Mir Cəlal.

◊ **Səs çıxarmadan** – sakitcə, səssiz, susaraq, dinmədən. *Nəriman səs çıxarmadan ötənin qıçından tutdu və yerə çırpıb boğazladı.* Mir Cəlal. **Səs çıxmamaq** – cavab verməmək, səssiz-səmirsiz oturmaq, danışmamaq, dinləmək, susmaq. *Əvvəlcə heç kimdən səs çıxmadı.* M.Hüseyn. *Odunçuoğlu elə bil* [tarçını] *eşitmir, heç kəsin üzünə baxmır, başını aşağı dikib, yerindən qımıldanmır, ondan bir səs çıxmırdı.* Ə.Məmmədxanlı. **Səsə düşmək** – b a x **dilə-ağıza düşmək** 1-ci mənada. *Sözüm dilə düşdü, mən səsə düşdüm; Dilimin ucundan qəfəsə düşdüm.* B.Vahabzadə. **Səsi kəsilmək** – susmaq, dinməmək, kiriməк. *Nə qədər ki gəlir təndə nəfəsim; Bülbüli-şeydatək kəsilməz səsim.* Q.Zakir. *Ol xoruzu öldürübən atdılar; Ta ki kəsilsin səsi asudəcə.* A.Səhhət. **Səsinə səs vermək** – çağırışa cavab vermək, həmrəylik göstərmək. *Xalqın ən yaxşı oğulları Zərdabinin səsinə səs verir və onun ətrafına yığışırdı.* M.İbrahimov. *Məsmə qadınlar arasında .. səsinə səs verənlər olduğunu görüb cürətləndi.* Mir Cəlal. **Səsini çıxartmamaq** – susub qalmaq, dinməmək, danışmamaq, susmaq. *Hacı Səməd isə səsini çıxartmayıb öz-özünə yavaşcadan oxumağa başladı.* S.S.Axundov. [Veysəl:] *Yatanların oyanmasından qorxub səsini çıxartmadı.* Ə.Vəliyev. **Səsini içinə (içəri) salmaq (çəkmək)** – tam sükut etmək, səsini çıxartmamaq, tamamilə susmaq. *Aşıq Sənan səsini içəri saldı.* "Abbas və Gülgəz". *Şahin əvvəlcə üz-gözünü turşudub ufuldadı, sonra səsini içinə çəkdi.* İ.Şıxlı. **Səsini səsinə qatmaq** – 1) səsinə səs vermək, birgə hərəkət etmək, həmrəy olmaq; 2) b a x **səs-səsə vermək**. *Molla da bunun yanında əyləşib, səsini qatır onun səsinə, başlayır ağlamağa.* "M.N.lətif." **Səs-səsə vermək** – bir yerdə ağız-ağıza verərək oxumaq, yaxud danışmaq, qışqırmaq. *Uşaqlar sözlərini qurtarmamış üçü də səs-səsə verib ağlaşdılar.* Çəmənzəminli. *..Körpə uşaqlar quş kimi səs-səsə vermişdilər.* Mir Cəlal. **Qulağına səs gəlmək** – eşitmək. *Bir gün Mirzə Səfər rastabazardan ötərkən qulağına səs gəldi: Mirzə Səfər! Mirzə Səfər!* Ə.Haqverdiyev.

**SƏSGÜCLƏNDİRİCİ, SƏSGÜCLƏNDİRƏN** *is. xüs.* Səsi (həm adam, həm musiqi alətlərinin və s.-nin səsini) gücləndirmək üçün cihaz. // Sif. mənasında. *Səsgücləndirici cihazlar*.

**SƏSƏQOYMA** *is.* Bir məsələnin, ya bir namizədin məqbul olub-olmadığını səsvermə yolu ilə müəyyən etmə. *Səsəqoymanın nəticəsi*.

**SƏSKEÇİRMƏYƏN** *sif.* Səsi buraxmayan, keçməyə qoymayan, səslərdən təcrid olunan. *Səskeçirməyən kamera. Səskeçirməyən material.*

**SƏS-KÜY** *is.* Qışqırıq, qalmaqal, hay-küy, dava-dalaş səsi, qarışıq, bərk səs. *Camaat hamısı dolur içəri, səs-küy düşür*. Ü.Hacıbəyov. *Səs-küy artdı, ara qarışdı, üstü içki və yeməklə dolu stollar çevrilib alt-üst oldu*. S.Vəliyev. [Bəkir:] *Mən ikicə kəlmə desəm, o saat səs-küyə səbəb olar*. İ.Hüseynov.

**SƏS-KÜYLÜ** *sif.* Çox səs olan, gurultulu, gurultusu çox olan; qələbəlik. *Səs-küylü yer. Səs-küylü bazar. Səs-küylü məclis*.

**SƏSLƏMƏ** "Səsləmək"dən *f.is.*

**SƏSLƏMƏK** *f.* Çağırmaq, haraylamaq. *Uşağı səslə, gəlsin. Qonşunu səsləmək. – Bahadır çox sağ ol, – deyib Novruzu səslədi.* N.Nərimanov. *..Eldar boylanıb onları tanıdı və səslədi*. M.Rzaquluzadə. *Yamyaşıl zəmilər, gömgöy meşələr; Şirin nəğməsiylə səsləyir bizi.* N.Xəzri.

**SƏSLƏNDİRMƏ** "Səsləndirmək"dən *f.is.*

**SƏSLƏNDİRMƏK** *f.* Hər hansı bir musiqi alətini, yaxud zəngi və s.-ni çalmaq, səsini çıxartmaq. *Tarı səsləndirmək. Sazı səsləndirmək. – Sən də alıb ələ bir qızıl rübab; İncə tellərini səsləndir, a qız!* M.Müşfiq. *Hümmət sükut içində zəngi səsləndirdi*. İ.Əfəndiyev.

**SƏSLƏNMƏ** "Səslənmək"dən *f.is. Əhməd öz işlərinin musiqi dilinə köçürülməsini, bütün hava dalğalarında səslənməsini istəyirdi.* S.Rəhimov.

**SƏSLƏNMƏK** *f.* 1. Səs çıxartmaq. *Budaqlar tərpəndi, ağaclar səsləndi*. Mir Cəlal. *Ağaclar başında səslənir külək; Yarpaqlar uzaqdan yelpiklənərək.* B.Vahabzadə. // Səsi çıxmaq, səsi eşidilmək. *Qonşu otaqdan zəng səsləndi, Firuzənin gülüşləri və mahnısı eşidildi.* C.Cabbarlı. *Radio səslənir: – Hüseyn, dön geri; Qalxmışdır ehtiyat təyyarələri*. M.Rahim.

2. Çağırana cavab vermək, səsini ucaltmaq. *Bu vaxt eşikdən Qulam xan səslənir*. M.S.Ordubadi. *..Nəriman əmi nəşə ilə səsləndi.* İ.Əfəndiyev. *..Sahibkarlar və dükançılar dayanan topadan kimsə bərkdən səsləndi*. Ə.Əbülhəsən.

**SƏSLƏŞMƏ** "Səsləşmək"dən *f.is. Arabir kənd qaydası səsləşmə yolu ilə də komanda verilirdi*. P.Makulu.

**SƏSLƏŞMƏK** 1. *qarş.* Bir-birini səsləmək. *Qızlar bir-biri ilə səsləşdilər. – Hər evdən şən bir gənc səsi eşidilirdi. Səsləşdik.* Çəmənzəminli. // Səs-səsə vermək, səslərini çıxarmaq (çoxları haqqında). *Zərnişanın eyvanın yarısı boyda düzəltdirdiyi arakəsmə qəfəsdəki toyuqlar da çaxnaşır, səsləşirdi*. B.Bayramov.

2. *məc.* Bir-birinə uyğun gəlmək, daxilən oxşamaq, həmahəng olmaq, müvafiq olmaq. *Müasir həyatla səsləşən əsər. – ..O zaman Qafqaz xalqlarının həyatında, sənət və ədəbiyyatında zəmanənin qabaqcıl fikir və ideallları ilə səsləşən diqqətəlayiq təzahürlər olmuşdur*. M.İbrahimov.

**SƏSLİ, SƏSLİ-KÜYLÜ** bax **səs-küylü**.

**SƏS-SƏDA** bax **səs** 1-ci mənada. ..[Gecə yarısı] *səs-səda kəsilir*. M.S.Ordubadi. *Közün üstünə düzülmüş göbələklərin cızıltısından özgə səs-səda eşidilmədi.* B.Bayramov.

**SƏS-SƏMİR** *is.* 1. Bax **səs** 1-ci mənada. *Sonra səs-səmir kəsilib, kənd dərin bir sükuta qərq oldu*. Çəmənzəminli.

2. Xəbər, soraq, məlumat; söz-söhbət. *Əcnəbidən daha səs-səmir yox idi*. S.M.Qənizadə.

**SƏS-SƏMİRSİZ** *sif.* və *zərf* Səs-siz, küysüz, səs çıxarmadan, sakitcə. [Yaşar] *səs-səmirsiz geyinib bayıra çıxdı.* M.Rzaquluzadə. [Bəy öz-özünə:] *Bəxt belə səs-səmirsiz açılır da*. Mir Cəlal.

**SƏSSİZ** *sif.* və *zərf* 1. Səs çıxarmayan, səs çıxarmadan, asta(dan), yavaş(dan). *Lakin* [Nuriyyənin] *balaca qəlbi səssiz, lal nəğmələr oxuyaraq məchul bir ümidlə yaşadı*. İ.Əfəndiyev. *O səssiz nəğmələri; Suların qucağından; Qopara bilsin gərək*. B.Vahabzadə. // Dinməz, dinməz-söyləməz, kirimiş,

susmuş (halda). *Yusif və Bahadır gözlərini silib xeyli vaxt səssiz oturdular*. N.Nərimanov. *Gövhər nənə səssiz hər bir masanın kənarına bir stəkan çay qoyub qayıdırdı.* S.Rəhimov.

2. Sakit, səs-küysüz, sükut içində. *Hər saat dolanır bir dəqiqə tək; Səssiz gecələrin ömrü gödəlir*. S.Vurğun. *Kənd səssiz bir halda məzar sükutu içində yatırdı*. M.İbrahimov.

**SƏSSİZCƏ** *zərf* Səssiz, səssiz-səmirsiz, sakitcə. *Səssizcə oturmaq*.

**SƏSSİZLİK** *is.* Heç bir səs olmadığı hal; tam sakitlik, sükut.

**SƏSSİZ-SƏMİRSİZ** *sif.* və *zərf* Tamam səssiz, sakit, tam sükut içində. *Səssiz-səmirsiz gecələr. Səssiz-səmirsiz kənd. Səssiz-səmirsiz oturmaq. – Avqust .. səssiz-səmirsiz otaqdan çıxıb yavaşca qapını örtdü*. S.Vəliyev. [Şair:] *Böyük məhəbbət də böyük çay kimi; Axar ürəklərdən səssiz-səmirsiz*. N.Xəzri.

**SƏSTUTAN** *is. xüs.* Təyyarənin, sualtı qayığın və s.-nin səsini tutmaq üçün cihaz. // Sif. mənasında. *Səstutan aparat.*

**SƏSVERMƏ** *is.* Seçki zamanı və ya bir işi, məsələni kollektiv surətdə həll etdikdə öz səsini vermə, səs vermək vasitəsilə rəyini bildirmə; səs vermək vasitəsilə seçmə və ya bir məsələni həll etmə. *Səsvermədə iştirak etmək. Səsvermənin nəticələri. Seçkilər gizli səsvermə yolu ilə keçirilir.*

**SƏSYAZAN** *is. xüs.* Danışıq səsini, musiqini lentə, lövhəciyə və s.-yə yazmaq üçün xüsusi cihaz. // Sif. mənasında. *Səsyazan cihaz.*

**SƏTƏLCƏM** *is.* [*ər.*] Bərk soyuqdəymə nəticəsində ağ ciyərdə əmələ gələn iltihab – xəstəlik. *Hacı Nəsir.. arvadının üstünə müalicə üçün bir neçə məşhur həkim gətirdisə də, sətəlcəm azarından sağalda bilmədi*. S.S.Axundov. [Həkim Kərəmə:] *İkitərəfli sətəlcəmdir, çox bərk soyuq dəyib*. M.İbrahimov.

**SƏTH** *is.* [*ər.*] 1. Bir şeyin xarici tərəfi, üst tərəfi, üz tərəfi. *Yer kürəsinin səthi. Taxtanın səthi.*

2. Səviyyə. *Pəncərənin yarısı küçənin səthindən aşağı olduğu üçün bütün zibilləri yel daşıyıb, buraya toplardı*. Çəmənzəminli. // *riyaz*. Həndəsi cismi digər cisimdən və ya xarici fəzadan ayıran hədd, hüdud.

**SƏTHİ** *sif.* və *zərf* [*ər.*] 1. Səthə aid olan.

2. *məc.* Dərin olmayan, dayaz, çox məhdud, qeyri-ciddi. *Hadisələrə səthi münasibət. Səthi mühakimələr*. – [Böyük oğlu] *bisavad idi, səthi düşünürdü*. Qantəmir. *Vəlinin adamlar haqqındakı təsəvvürü çox səthi idi.* M.Hüseyn.

**SƏTHİLƏŞDİRİLMƏ** "Səthiləşdirilmək"-dən *f.is.*

**SƏTHİLƏŞDİRİLMƏK** *məch.* Səthi (2-ci mənada) hala salınmaq, bəsitləşdirilmək, sadələşdirilmək, bayağılaşdırılmaq.

**SƏTHİLƏŞDİRMƏ** "Səthiləşdirmək"dən *f.is.*

**SƏTHİLƏŞDİRMƏK** *f.* Səthi (2-ci mənada) hala salmaq, səthi etmək; bəsitləşdirmək, bayağılaşdırmaq. *Bizcə, bu həm Kosaoğlunun təbiətinə ziddir, həm də surəti səthiləşdirir.* M.İbrahimov.

**SƏTİR** *is.* [*ər.*] Hər hansı bir mətnin bir xətdə yazılmış hissəsi, yazı sırası. *İki sətir yazı. – Səmədin köməyilə sətirləri höccələyə-höccələyə oxuduqca çobanın gözlərində qeyri-adi bir parıltı əmələ gəlirdi*. İ.Hüseynov.

**SƏTİRALTI** *sif.* 1. Sətirlərin (səhifənin) altında olan. *Sətiraltı qeyd, işarə.*

2. *məc.* Gizli, örtülü. *Sətiraltı məna*.

**SƏTİRBAŞI** *is.* Mətnin hər hansı bir hissəsinin birinci sətrinin başında buraxılan açıq yer, boşluq; abzas.

**SƏTİRBƏSƏTİR** *sif.* [*ər.* sətir və *fars.* bitişdirici bə] Hər sətri ayrılıqda, sətir-sətir. *Sətirbəsətir təhlil etmək. Sətirbəsətir tərcümə etmək.*

**SƏTRİ** *sif.* [*ər.*] Sətirbəsətir, hərfi. *Sətri tərcümə.*

**SƏTTAR** *sif.* [*ər.*] *köhn.* Örtən, ört-basdır edən.

**SƏVA** *klas.* bax **savayı**. *Candan səva dəhanına yox nəzri Seyyidin; Olsun qəsəm o canına kim, yoxu vardır*. S.Ə.Şirvani.

**SƏVAB** *klas.* bax **savab**. *Mənim könlüm olubdur səngdil bütlər evi, Qövsi; Səvab üçün onu mən dəxi viyran etməyim, neylim?* Q.Təbrizi. *Halvanın və xeyrat plovlarının səvabı və lazım olmağını dananlar kafir və mürtəddirlər.* Ə.Haqverdiyev.

**SƏVAYI** *klas.* bax **savayı**. *Munca kim etdim tamaşa, sözlərə asdım qulaq; Kizbüböhtandan səvayı bir hekayət görmədim.*

M.P.Vaqif. *Qəmdən səvayı qəm günü qəmxar yox, könül..* X.Natəvan. [Ömər:] *Əvvəla, qızı görməmişəm və ondan səvayı, qız on, ya on bir yaşında.* N.Nərimanov.

**SƏVİYYƏ** *is.* [*ər.*] 1. Suyun və b. bir mayenin qalxma, yüksəlmə dərəcəsi. *Çayda suyun səviyyəsi xeyli qalxmışdır. Dəniz səviyyəsi* (*yer səthində yüksəklikləri müəyyən etmək üçün əsas götürülən nöqtə*).

2. Bir şeyin hündürlüyünün hüdudunu təşkil edən şərti üfüqi xətt və ya səth.

3. Bir şeyin inkişafının keyfiyyət və kəmiyyət dərəcəsi. *Xalqın maddi və mədəni həyat səviyyəsi. Bilik səviyyəsi. Əsərin bədii səviyyəsi aşağıdır. – Yalnız kollektiv təsərrüfat quruluşu bizim kəndimizi indiki mədəni, varlı səviyyəyə gətirib çatdırmışdır.* İ.Əfəndiyev.

**SƏY** *is.* [*ər.*] 1. Çalışma, çalışıb-çapalama, cəhd. *Səyi bir nəticə vermədi. – Öhdəmizə götürdüyümüz vəzifəni əda etməkdə bacarığımızı və səyimizi əsirgəməyəcəyiz..* C.Məmmədquluzadə. ☐ **Səy etmək (eləmək)** – bir işi yerinə yetirmək və ya bir şeyi əldə etmək üçün var gücü ilə çalışmaq, cəhd etmək, çalışıb-çapalamaq, əlləşmək. *Aslan nə qədər səy eləyirdi ki, Əsgərin hüsn-rəğbətini qazansın, mümkün olmurdu.* C.Cabbarlı. *Eşikdə olanlar özlərini evə salmağa səy edirlər.* Mir Cəlal. **Səy göstərmək** – çalışmaq, əlləşmək, cidd-cəhd etmək. *Sosialistlərə yaxınlaşanda Kərim "səy" göstərdi, gözə girməyə, qabaq cərgəyə çıxmağa cəhd etdi.* M.İbrahimov.

2. **Səylə** şəklində *zərf* – səy göstərərək, çox çalışaraq, bacardığı qədər cəhd edərək, var gücü ilə. *Ağdöşlüklü qadınlar müştərilərə səylə qulluq eləyirdilər.* M.Hüseyn. *Rüstəm kişinin başına* [Yarməmməd] *xüsusi bir səylə fırlanırdı.* M.İbrahimov.

**SƏYAHƏT** *is.* [*ər.*] Müəyyən məqsədlə (elmi, bir yerlə tanışlıq, idman və s.) ayaqla, ya miniklə yaşadığı yerdən uzaqlara getmə, səfər etmə. *Dağlarda səyahətdə olmaq. Dəniz səyahəti. – Mirzağa elmi tənəzzöhlərə, səyahətlərə bir kərə də olsun getməmişdi.* S.Hüseyn. *Validə məzuniyyətə çıxıb İbadla təzə maşında səyahətə getmişdi.* H.Seyidbəyli. ☐ **Səyahət etmək** – b a x **səyahətə çıxmaq**. **Səyahətə çıxmaq** – gəzmək, səfər etmək. *Hacı Səlimin övladı yox idi, işlərinə arvadının qardaşı baxırdı, özü ildə bircə dəfə səyahətə çıxıb şöbələrinə və əmlakına nəzər yetirərdi.* Ə.Haqverdiyev. [Gündüz Gülüşə:] *Bax, bibi, biz dünən məktəbdə uşaqlarla dünya səyahətinə çıxmışdıq*. C.Cabbarlı.

**SƏYAHƏTÇİ** *is.* Səyahət edən, səyahətə çıxan adam. *Çayın üzərində bircə dənə də yelkən yox idi, çünki şəhərin bu tərəfləri uzaq olduğu üçün səyahətçilər mərkəzdə gəzməyi sevirdilər.* M.S.Ordubadi. *Bir də gördüm .. səyahətçi libasında bir şəxs .. imarətə baxır.* S.S.Axundov.

**SƏYAHƏTNAMƏ** *is.* [*ər.* səyahət və *fars.* ...namə] Səyahət zamanı səyahətçinin görüb, gözdən keçirdiyi şeylərə dair yazdığı kitab və s. [Mozalanbəy:] *İranda da bir səyahətnamə yazaram, axırda genə Qafqaz durur, mən dururam.* Ə.Haqverdiyev. *Əski səyahətnamələrlə indikilər arasında çox ayrılıqlar var*. Qantəmir.

**SƏYİRMƏ** "Səyirmək"dən *f.is.*

**SƏYİRMƏK** b a x **səyrimək**. *Naçalnik Qulam dayının gözlərinin içinə baxdı, onun üst dodağı azca səyirdi*. M.Hüseyn.

**SƏYİRTMƏ** "Səyirtmək"dən *f.is.*

**SƏYİRTMƏK** *f.* 1. Çapmaq, dördnala sürmək (atı). [Ayaz] "*Tərlanı*" *üzüyuxarı kəndə tərəf səyirtdi*. Ə.Məmmədxanlı. *Atımı dördnala səyirdərək mən; Nəhayət, Boz dağa gəlib yetişdim*. H.Hüseynzadə.

2. Uçurtmaq (quşlar haqqında). [Kərəm:] *Şahini gəzdirər bəylər qolunda; Quşları səyirdər sagü solunda*. "Əsli və Kərəm".

**SƏYLİ** *sif.* 1. Səy edən, çalışqan, cəhdli. *Səyli tələbə. – ..Ağabalanın çənəsindən tutub: – Maşallah, çox səyli uşaqdır! – deyirdi.* Çəmənzəminli.

2. İnadlı, ardıcıl, gərgin. *Həkimin səyli müalicəsi, verdiyi dərmanlar bu xəstəliyin qabağında acizlik edirdi*. S.Rəhimov.

**SƏYRİMƏ** "Səyrimək"dən *f.is.*

**SƏYRİMƏK** *f.* Hirsdən, acıqdan və s. hisslərdən əsmək, titrəmək (üz əzələləri). *Ağzı səyrimək. Burun pərəkləri səyrimək. – İsmayılzadənin dodaqları xəfif bir tərzdə səyridi.* M.Hüseyn. *Hərdən Mirzə Cəlilin yanaqlarının əti səyriyir, dodaqları tərpənirdi.* Ə.Vəliyev.

**SƏYRİŞMƏ** "Səyrişmək"dən *f.is.*

**SƏYRİŞMƏK** *f.* 1. Bax **sayrışmaq** 1-ci mənada. *Böyük əgər desə gündüzə gecə; De, göydə ulduzlar səyrişir necə!* Q.Zakir. *Şəhər elektrik içində səyrişir, göyün qübbəsindən təyyarələrin gurultusu gəlirdi*. S.Rəhimov.

2. Titrəmək, xəfif-xəfif əsmək, səyrimək. *..Sarayın darvazası açıldı, orada qaraltılar səyrişdi, cəsarətsiz qırıq səslər gəldi*. Çəmənzəminli. *Baxdıqca adama elə gəlir ki,* [dağlar] *xəfif-xəfif səyrişir*. R.Rza.

**SƏYYAD** *is.* [*ər.*] *klas.* Ovçu. *Gəzmə, ey könlüm quşu, qafil fəzayi-eşqdə; Kim, bu səhranın güzərgahlarda çox səyyadı var*. Füzuli. *Mən sənin bir rəhmdil səyyadınam, gəl qoynuma; Gəl öpüm, gəl oxşayım, ey nazənin ahu, səni!* M.Müşfiq.

**SƏYYAH** [*ər.*] bax **səyahətçi**. *İki gündən bəri yeməmiş səyyahlar böyük bir iştaha ilə yeməyə başladılar*. Çəmənzəminli. [Gilanqızı:] *Siz özünüzün bir qəzet müxbiri, səyyah olduğunuzu söyləyirdiniz*. S.Hüseyn.

**SƏYYAHLIQ** *is.* Səyyah olma, səyahətə çıxma. *Teymur müəllim bunu da bilirdi ki, o öz maraqlı hekayələri ilə şagirdlərin qəlbində səyyahlığa, kəşfiyyatçılığa böyük həvəs oyatmışdır*. Ə.Sadıq.

**SƏYYAL** *sif.* [*ər.*] Axıcı, axan, sərbəst, rəvan. *Tahir sükanı qaba və sərt hərəkətlərlə o yan-bu yana fırladır, maşının səyyal hərəkətinə mane olurdu*. M.Hüseyn.

**SƏYYAR** *sif.* [*ər.*] 1. Hərəkət edən, gəzən, dolaşan; bir yerdə durmayan. *Səyyar ulduzlar*.

2. Daim bir yerdə qalmayan, yerini dəyişdirən, daim bir yerdə durmayıb istənilən tərəfə daşınan. *Səyyar ticarət. Səyyar sərgi. Səyyar xəstəxana*. – [Məmun] *..iki gün orda səyyar bir sarayı andıran qara məxmərli nəhəng çadırı altında istirahət edəcəkdi*. M.İbrahimov. *..Bu* [parlaq kölgələr] *kolxoza gəlmiş səyyar kinonun ekranı idi*. Ə.Sadıq. *Balaqan səyyar küçə teatrına deyilir*. Ə.Bədəlbəyli.

**SƏYYARƏ** [*ər.*] bax **planet**. *Gah doğur, gah batır könül diqqətim; Tez-tez yanıb-sönən səyyarələrtək*. S.Vurğun. *Sən elə bir dəryasan ki, bütün çaylar axır sənə; Sən elə bir günəşsən ki, işıq alır səyyarələr*. N.Xəzri.

**SƏZA** *sif.* [*fars.*] Layiq, uyğun, yaraşan, münasib. *Məncə, təqdirə səzadır, kişi şeytandan alıb; Kamil öyrəndiyi elmilə, dürusilə belə*. M.Ə.Sabir.

**SFERA** *is.* [*yun.*] Sahə, dairə, mühit, şərait.

**SFERİK** *sif.* [*yun.*] Kürəşəkilli, kürəyəbənzər, yuvarlaq.

**SFİNKS** *is.* Qədim Misirdə şir bədənli, insan başlı və ya heyvan başlı fantastik varlığın heykəli.

**SXEM** [*yun.* schema – şəkil, surət] 1. Bir şeyin sistemini, quruluşunu və ya hissələri arasındakı rabitəni təsvir edən sadə çertyoj. *Telefon qurğusunun sxemi*. *Radioaparatın sxemi*. // Bir şeyin quruluşu, təşkili, planı. *Başqa sxem üzrə qurulmuş təşkilat*.

2. Bir əsərin, yazının və s.-nin əsas fikirlərinin ümumi şəkildə verilmiş şərhi, təsviri, xülasəsi. *Pyesin sxemi. Məruzənin sxemi.*

3. *məc.* Şablon fikir, bir şeyin çox bəsit və mücərrəd təsviri; basmaqəlib. *Əsərdə canlı insanlar əvəzinə sxemlər verilmişdir. – Cabbarlı Almaz simasında cansız bir sxem yox, bütün xüsusiyyətləri ilə meydana çıxan, sevib-sevilən bir insan surəti yaratmışdır.* M.Arif.

**SXEMATİ́K** *sif.* [*yun.*] 1. Sxem şəklində, sxem halında. *Sxematik xəritələr.*

2. Ümumi şəkildə, təfərrüatsız, çox sadə şəkildə, yığcam. *Əsərin sxematik şərhi. – Əsərdə Ağa Məhəmməd şah Qacarın cəllad, qatil və talançı sifəti sxematik şəkildə deyil, mürəkkəb bir xarakter kimi, kamil bədii xasiyyətnamə ilə canlandırılır.* M.Arif.

**SXEMATİKLİK** *is.* Sxematik (2-ci mənada) şeyin halı. *Təsvirin sxematikliyi. Pyesin sxematikliyi.*

**SXEMATİ́ZM** [*yun.*] Təfəkkürdə, bir şeyin şərhində, təsvirində bayağılıq, şablonluq. *Yazıçılarımız müasir qəhrəman surətinin təsvirində bəzi sxematizmə yol verirlər.*

**SXOLÁSTİK** 1. Sxolastika (1-ci mənada) tərəfdarı.

2. Sxolastika (2-ci mənada) ilə məşğul olan adam.

**SXOLASTİ́K** *sif.* [*yun.*] 1. Sxolastikaya (1-ci mənada) aid olan, sxolastika mahiyyətində olan. *Sxolastik fəlsəfə.*

2. *məc.* Formal, zahiri, real məzmundan məhrum, real həyatdan uzaq. *Sxolastik tənqid. Sxolastik mühakimə. –* "*Kəşkül*" *səhifələrində köhnə sxolastik ədəbiyyat üslubu ilə hakim*

*ədəbi cərəyan olmağa başlayan realizm ədəbi üslubu mübarizə edir*. M.İbrahimov.

**SXOLÁSTİKA** [*lat.* scholasticus, əsli *yun.* shole – məktəb] 1. Orta əsr fəlsəfəsində kilsə ehkamlarına mücərrəd, formal məntiqi dəlillərlə haqq qazandırmaq məqsədini daşıyan hakim cərəyan.

2. *məc.* Real həyatdan, təcrübədən uzaq olan; boş, formal.

3. *məc.* Boş mühakimə, həyat və təcrübədən uzaq formal bilik; əzbərçilik, əllaməlik.

**SICAQ** *sif.* 1. İsti.

2. Mehriban, yaxın.

**SIÇRAMA** "Sıçramaq"dan *f.is.*

**SIÇRAMAQ** *f.* 1. Atılmaq, tullanmaq, hoppanmaq. *Yerindən sıçramaq. İrəliyə sıçramaq. – Əsəd sıçrayıb bir daşın dalında gizlənərək bayaq gördüyü yerə baxdı.* B.Talıblı. // Atlanıb (hoppanıb) keçmək. *Gülşən Yasəmənin sözündən xoşlanmadı: – Arxı sıçramamış barakallah gözləməyin.* Ə.Vəliyev. // Hoppanıb qalxmaq (oturmaq). *Surxay kəhərin belinə sıçradı.* M.İbrahimov. *Oğul sıçradı ata, yel kimi uçdu getdi; Elə bil ov dalınca alıcı quşdu, getdi.* R.Rza.

2. Səpilmək, çilənmək. *Sıçrayarkən işıldayar damcılar; San saçılar mirvaridlər, incilər.* A.Səhhət.

**SIÇRANTI** *is.* Sıçrayan, ya sıçradılan su və s. zərrəcikləri.

**SIÇRATMA** "Sıçratmaq"dan *f.is.*

**SIÇRATMAQ** *f.* Sıçramasına səbəb olmaq. *Suyu sıçratmaq*.

**SIÇRAYIŞ** *is.* 1. Sıçrama işi, sıçrama tərzi; yerindən hoppanma, atılma. *Zərəngiz sıçrayışa hazırlanan pişik kimi özünü yığışdırdı.* H.Seyidbəyli.

2. *məc.* Bir şeydə birdən-birə baş verən dəyişiklik.

3. *fəls.* Tədriclə yox, birdən-birə və çox sürətlə bir keyfiyyətdən başqasına keçmə. *İnqilabi sıçrayış*.

**SIÇRAYIŞLI** *sif.* Sıçrayışlarla olan, sıçrayışlarla inkişaf edən, baş verən; qeyri-müntəzəm. *Sıçrayışlı inkişaf.*

**SIÇRAYIŞVARİ** *sif.* və *zərf* Sıçrayışlarla (3-cü mənada) inkişaf edən, baş verən; qeyri-müntəzəm. *Sıçrayışvari inkişaf.*

**SIFIR** *is.* [*ər.*] 1. Kəmiyyətin olmadığını göstərən "0" şəklində rəqəm işarəsi (sağ tərəfdən hər hansı bir rəqəmin yanına gətirildikdə onun on dəfə artdığını bildirir).

2. Bir şeyin temperaturunu hesablamaq üçün nisbət götürülən şərti kəmiyyət. *Sıfır dərəcə. Sıfırdan aşağı üç dərəcə soyuq.*

3. *məc.* Heç bir əhəmiyyəti, rolu, qiyməti olmayan adam haqqında; heç. *Tutaq ki, sən indi heç bir şeysən, bir sıfırsan..* Çexovdan.

◊ **Sıfır dərəcə** *məc.* – heç, qətiyyən, əsla. *Əlikram bu danışığa sıfır dərəcə əhəmiyyət vermirmiş kimi Səlimin qalın cildini götürüb qoltuğuna vurdu*. B.Bayramov.

**SIĞA** *is.* [*ər.*] *köhn.* 1. Kiçik uşaqlar.

2. Yetimlər.

**SIĞAL** *is.* [*ər.* seyqəl] 1. Bir şeyin üzərinə əlini yavaş-yavaş gəzdirmək və ya ona xəfif-xəfif toxundurmaqla öz sevgisini, nəvazişini göstərmə. □ **Sığal çəkmək** *məc.* – oxşamaq, tumarlamaq, sığallamaq. *Meh sığal çəkən zaman aqronomun telinə; Bir ovuc torpaq aldı o, fərəhlə əlinə.* M.Rahim. *Dağların küləyi, bağların mehi; İncik ruhumuza bir sığal çəkir.* B.Vahabzadə.

2. Cila, süs, bəzək. □ **Sığal vermək (vurmaq, çəkmək)** – bəzək, süs vermək, yaraşıq üçün saçlarına, üst-başına səliqəli görkəm vermək. *Canan sığal vurub çıxır otaqdan; Nə gözəl yaraşır bu gediş ona*. S.Vurğun. *O, fikrində bu məsələni vuruşdurduğu zaman Qərənfil Nərgizə sığal verdi.* Ə.Vəliyev. *Gözə sürmə, tellərinə sığal çək; Sənə heyran olub çəmən, gül, çiçək*. A.Şəmşir.

**SIĞALLAMA** "Sığallamaq"dan *f.is.*

**SIĞALLAMAQ** *f.* Əllərini, barmaqlarını bir şeyin üzərində xəfifcə gəzdirərək onu hamar şəklə salmaq, düzəltmək; tumarlamaq. *Saqqalını sığallamaq. Saçlarını sığallamaq. Telini sığallamaq*. // Masaj eləmək, ovmaq. *Əlacı üzülmüş Nərgiz gah oğlunu dilə tutur, gah qarıya kömək eləyib uşağın qarnını sığallayır*. Ə.Vəliyev. // Nəvaziş, mehribanlıq, riqqət, oxşama əlaməti olaraq əlini xəfifcə birinin başına və ya üstünə sürtmək, çəkmək. *Kosa isə öz işində olmaqla toyuqlardan tutub başını sığallayır və buraxırdı.* S.Rəhimov. *Kabla Novruzqulu* [uşaqları] *öpüb, sığallayıb, hərəsinin ovcuna bir ağ pul bayramlıq*

*basardı*. H.Sarabski. // Məc. mənada. *Ləpələr sığallayır nəhəng gövdəsini "Avrora"nın; Yuxulu bir ananın əli kimi.* R.Rza.

**SIĞALLANMA** "Sığallanmaq"dan *f.is.*

**SIĞALLANMAQ** *qayıd*. Özünə sığal, yaraşıq vermək, gözə xoş, gözəl görünmək üçün saçlarına, üz-gözünə, üst-başına səliqə vermək. *Mənim yarım sığallanıb gələndə; Sanasan qan süzür dodaqlarından*. M.P.Vaqif. [Milis müvəkkili] *şıq geyinmişdi, sığallanıb toqqalanmışdı*. B.Bayramov. // Məc. mənada. *Qoca çinar! Bir sığallan kəhriz başında; Göy çəmənə xalı kimi öz kölgəni sər!* S.Vurğun. *Səhər yelləriylə sığallanmısan; Ay bizim çinara bənzəyən çinar!* N.Xəzri.

**SIĞALLI** *sif.* Hamar, sığal çəkilmiş kimi olan; səliqəli. *Sığallı saçlar. – Yuyundun, darandın, qarlar kimi saf; Tellərin sığallı, gözlərin şəffaf.* Ə.Cavad.

**SIĞINAQ, SIĞINACAQ** *is.* Sığınılacaq yer, daldalanmağa yarar yer; daldanacaq; sığıncaq. *Partizanlar .. özlərinə sığınacaq bir yer düzəltdilər.* M.Hüseyn. [Ana] *ətrafına baxınır, gözləri daldalanmaq üçün bir bucaq, sığınaq axtarır.* Ə.Məmmədxanlı. *Nəriman zirzəminin sığınacaq olduğunu görüb sevindi.* Mir Cəlal. // *xüs*. Bombadan, mərmidən, güllədən və ya zəhərləyici maddələrdən qorunmaq üçün xüsusi surətdə düzəldilib təchiz edilmiş yer, bina və s. *Bomba sığınağı*.

**SIĞINCAQ** b a x **sığınaq**. *Bu dağ başındakı möhtəşəm qala; Olmuş sığıncağı qəhrəmanların*. S.Vurğun.

**SIĞINMA** "Sığınmaq"dan *f.is. Dara qocanın etinasızlığına və heyvanın ona sığınmasına heyrət edərək hiddətlə: – Qoca! – deyir, – sən kimsən?* Çəmənzəminli.

**SIĞINMAQ** *f.* Bir təhlükədən etibarlı bir yerdə gizlənmək və ya birinə pənah gətirmək, himayəsi altına girmək; daldalanmaq. *Səhərlərə məxsus olan nəsimdən ara-sıra yarpaqlar qımıldanır, ..yaşıl yarpaqlar arasına sığınmış quşcuğazlar səs-səsə verib ötüşürdü*. A.Şaiq. *Bir gün toplanıb Almazın sığındığı qayınatası Ağa kişinin evinə getdik.* S.Rəhimov.

**SIĞIR** *is.* 1. Qaramal. [Çopo:] *Piyaləni qaldırdım, yavaş səslə: – Sənin şərəfinə, – dedim, – xoşbəxt olaq, qəbilə sığırları kök, itləri itidişli olsun!* Çəmənzəminli.

2. *zool.* Belşəkilli buynuzları olan maral fəsiləsindən iri kövşəyən məməli heyvan.

**SIĞIRÇI** *is.* Mal-qara çobanı; naxırçı. [Sona xanım:] *..Xalça burda qalıbdır. Yerdən qalxıb gəldim götürəm ki, tezdən sığırçıya, buzovçuya rast gəlib aparmasın.* M.F.Axundzadə. *Bizim qarabaş qız sığırçımızı oyadırdı.* A.Divanbəyoğlu. *Gəlir cənazəsi Hacının kəndə; Çoban, sığırçılar dağda, çəməndə; Baxırlar uzaqdan qanlı karvana*. H.K.Sanılı.

**SIĞIRÇIN** *is.* Quşların sərçəkimilər dəstəsindən olan, tündtüklü, oxuyan, köçəri quş. *Sığırçınlar səhərçağı gələr, budaqlara qonub səslənər, baharın müjdəsini gətirərlər.* Mir Cəlal. *Baharla birlikdə onun şux elçiləri: qaranquşlar, sığırçınlar.. hərəni öz dilində qarşılayırdılar...* M.Rzaquluzadə.

**SIĞIRDİLİ** *is. bot.* Ətirli yağ verən otbitki. *Sığırdili .. alaq otlarındandır. Pipepə oxşar ətirli yağı vardır.* M.Qasımov.

**SIĞIRQUYRUĞU** *is. bot.* Kök ətrafında bölüm-bölüm yarpaqları olan ikiillik ot-bitki.

**SIĞIŞDIRILMA** "Sığışdırılmaq"dan *f.is.*

**SIĞIŞDIRILMAQ** *məch.* Yerləşdirilmək, zorla sığdırmaq.

**SIĞIŞDIRMA** "Sığışdırmaq"dan *f.is.*

**SIĞIŞDIRMAQ** *f.* 1. Yerləşdirmək, güclə sığdırmaq. [Şair Ərəstun Şiraslana dedi:] ..[Ağbulağın işlərini] *heç balaca bir şerə sığışdırmaq olarmı, şair?* S.Rəhimov.

2. *məc.* Dözmək, qatlaşmaq, sinirmək. *Ayrım qızı .. naxır sahiblərinin töhmət və məzəmmətlərini izzəti-nəfsinə sığışdıra bilmədiyindən Kərim babanın arxasınca hər gün söylənərdi.* A.Şaiq. *Sığışdıra bilməyib; Paxıl arı bu dərdi; Dedi: "Gərək mən onu; Ruhdan salıb öldürəm".* M.Dilbazi.

**SIĞIŞMA** "Sığışmaq"dan *f.is.*

**SIĞIŞMAQ** b a x **sığmaq**. *Geyib əsgər paltarını, silahlandı qəhrəman; Onun polad sinəsinə sığışmadı ürəyi.* S.Vurğun.

**SIĞMA** "Sığmaq"dan *f.is.*

**SIĞMAQ** *f.* Yerləşmək, girə bilmək. [Məhəmmədcəfərin] *portfeli o qədər dolmuşdu ki, qoltuğuna sığmayırdı*. Qantəmir. *Nəriman Ülfətin qucağına sığmırdı*. Mir Cəlal. *Nəbi pəncəsinə sığmayan bafanı yerə qoyub belini düzəltdiyi zaman günəş onu salamladı.* Ə.Abasov.

**SIĞMAZ** *f.sif.* Bir araya sığışa bilməyən, bir araya sığışmaz, uyuşmaz. *Ömür sürən bəxtiyar; Pozulmasın düz ilqar; Sığmaz bu dünyalara; Könlümdəki arzular.* R.Rza.

**SIĞORTA** *is.* Təbii fəlakət və bədbəxt hadisə nəticəsində zərər görmüş şəxsə və ya təşkilata xüsusi təşkilat tərəfindən müntəzəm olaraq pul vermək vasitəsilə zərərini ödəməkdən ibarət təminat vasitələrindən biri. *Dövlət sığortası. İctimai sığorta. Əmlakını sığorta etdirmək.* – [Məhəmmədcəfər:] *Bu üçüncü – sığorta dəftərim, bu da mənim Baksoyuz dəftərim.* Qantəmir. [Məsmə:] *Mənim həyatımın 2-ci səhifəsi 23-cü ilin baharından başlayır. Bu zaman ev qulluqçularının sığorta edilməsi üçün qanun nəşr edilmişdi.* S.Hüseyn. *Qələmi yaxana sanc! Məndən sənə nə qazanc! Mən ölümdən sığorta istəmirəm.* R.Rza.

**SIĞORTAÇI** *is.* Sığorta idarəsi işçisi.

**SIĞORTALI** *sif.* 1. Sığorta edilmiş.

2. *məc.* Əmniyyət altına alınmış; təminatlı.

**SIX** *sif.* 1. Ağacları, budaqları, yarpaqları və s. bir-birinə çox yaxın, bitişik. *Sıx meşə. Sıx kol. Sıx çəmən.* – *..Dərələrində adamboyu qalxan sıx, ətirli otlar bitən bu yerləri körpəlikdən sevirdi.* İ.Hüseynov.

2. Qalın, gur, yoğun. *Sıx hörüklər.* – *Natiq sadə fəhlə paltarı geymiş, papağını əlinə almışdı. Onun sıx saçları uzanıb boynunun ardına sarı tökülmüşdü.* M.Hüseyn. *Füzuli çataraq sıx qaşlarını; Leylinin eşqinə saldı Məcnunu.* S.Vurğun.

3. *zərf* Bir-birinə yapışmış, çox yaxın. *Cərgədə sıx durmaq. Şeyləri sıx qoymaq.* // *sif.* və *zərf* Bir-birindən ayrılmaz, yaxın, əlaqəli (bəzən "sıxı" şəklində işlənir). *Sıx əlaqə.* – *..Arasında sıx bir rabitə vardı.* S.Hüseyn.

**SIXAC** *is.* Bir şeyi sıxmaq, sıxıb saxlamaq üçün alət, qurğu.

**SIXCALAMA** "Sıxcalamaq"dan *f.is.*

**SIXCALAMAQ** *f.* 1. Sıxıb əzmək, basıb əzmək.

2. Sıxışdırmaq.

**SIXICI** *sif.* 1. Sıxan, sıxmaq üçün olan. *Sıxıcı alət.*

2. *məc.* Darıxdırıcı, üzücü, cansıxıcı. *Sıxıcı bir mühit.* – [Qətibənin Qızıl Arslana məktubundan:] *Buna görə də hökmdar məni bu sıxıcı məngənənin altından qurtarmalıdır.* M.S.Ordubadi.

**SIXILMA** "Sıxılmaq"dan *f.is.* *Suyun sıxılma dərəcəsi.*

**SIXILMAQ** *f.* 1. Təzyiq, sıxma və s. nəticəsində həcmcə kiçilmək, sıxlaşmaq. // Daralmaq, sıxlaşmaq, balacalaşmaq. *..Getdikcə izdiham çoxalır, Ayazın ətrafını almış halqa daha da sıxılırdı.* Ə.Məmmədxanlı. *Nəhayət .. üç yol ayrıcında bu halqa tamamilə sıxıldı.* H.Seyidbəyli.

2. Büzüşmək, yığılmaq, qısılmaq. [Nadir:] *Müharibə zamanı üzərimə minlərcə düşmən qurşunu yağdı da, heç qorxmadım. Burada nə üçün sıxıldım, cücəyə döndüm?!* B.Talıblı. *Zərifə təzədən oturduğu yerdə qurcalanıb dayısına sıxıldı.* Ə.Əbülhəsən. [Tapdıq] *bərk-bərk anasının qucağına sıxılıb dayandı.* Ə.Vəliyev.

3. Pərt olmaq, utanmaq, tutulmaq. *Əhməd bundan bir şey anlamadı. Fəqət Zəkinin ona qarşı olan soyuq hərəkətindən çox sıxıldı.* A.Şaiq. *Fərman həmişə belə qoçaq və dilavər qızların yanında sıxılar və özünü itirərdi.* Ə.Sadıq.

◊ **Sıxılıb qalmaq** – balaca, dar bir yerdə yaşamalı olmaq; sığınmaq, daldalanmaq. [Dilarə Qurbanlıya:] *Bağışlayın, evimiz darkeşdir, iki otağa sıxılıb qalmışıq.* Çəmənzəminli. *Əri Heydərqulu* [Hörməti] *indi həyatin küncündə sıxılıb qalan və ailənin bir anbar kimi istifadə etdiyi bir daxmaya gətirmişdi.* Ə.Sadıq. **Ürəyi** (**könlü, qəlbi**) **sıxılmaq** – qüssələnmək, darıxmaq, xiffət etmək. [Pərviz xan:] *Ana, sən allah, burax qızı, aparaq, dərsini oxusun, hərgah Münəvvər orada olmasa bizim də qəlbimiz sıxılar.* M.S.Ordubadi. [Rüstəm bəy:] *Bir adam bir adama öyrəşir, alışır, onu görmədikdə könlü sıxılır.* Çəmənzəminli. *Qədirin ürəyi çox sıxıldı, yüzbaşını o indi başa düşmüşdü.* Mir Cəlal.

**SIXINTI** *is.* 1. Çətinlik, qısıntı, yoxsulluq, ehtiyac, korluq, güzəran ağırlığı. [Əmrah] *başdan-ayağa sıxıntı, fəryadla yoğrulmuş bir həyatdan küsməkdə haqlı idi.* M.Hüseyn. *Durnanın uşaqlığı sıxıntı içərisində keçmişdi.* Ə.Sadıq. ☐ **Sıxıntı çəkmək** – 1) maddi cəhətdən çətinlik çəkmək, korluq çəkmək, ehtiyac içində olmaq. *Min sıxıntı çəkirsən, güzəranın ağırdır; Dərdini eşitməyir tanrın,*

*niyə, sağırdır?* N.Rəfibəyli; 2) əzab çəkmək, əziyyət çəkmək. [Aydəmir İnciyə:] *İstəmirəm sən mənimçin bir sıxıntı çəkəsən, sənin adın çəkilsin*. C.Cabbarlı.

2. Darısqallıq nəticəsində duyulan narahatlıq. *Ailə bir otaqda sıxıntı içərisindədir*. – [Kənd məktəbinin müəllimi:] *Sizin evdə* [müəllim] *sıxıntı çəkər*. Ə.Haqverdiyev.

**SIXINTILI** *sif.* Qüssəli, kədərli, ağır, üzüntülü, cansıxıcı. *Gecə düşmüşdü. Bir neçə dəqiqə əvvəl sıxıntılı görünən otaq sanki istirahət saçmağa başladı.* Çəmənzəminli. *Ağır əzablar içində və olduqca sıxıntılı bir tərzdə o, gecəni səhər elədi.* Ə.Vəliyev.

**SIXIŞDIRILMA** "Sıxışdırılmaq"dan *f.is.*

**SIXIŞDIRILMAQ** *məch.* Başqasının təzyiqinə, sıxıntısına məruz qalmaq; sıxışdırılıb aradan çıxarılmaq.

**SIXIŞDIRMA** "Sıxışdırmaq"dan *f.is.*

**SIXIŞDIRMAQ** *f.* 1. Sıxmaq, sıxcalamaq. *Kəndlilər bir-birini sıxışdıraraq aralığı açıb Firidunu qabağa buraxdılar.* M.İbrahimov. *Hümmətlə Yusif özünü yetirəndə Həmzə Şahmarı yaxalayıb, hesabdarın stoluna sıxışdırmışdı.* B.Bayramov.

2. Sıxıntı vermək, incitmək, əziyyət vermək, qısnamaq, qısqı gəlmək. *Hacı Kərim* [Bəxtiyarı] *sıxışdırır və pulunu tələb edirdi*. S.Hüseyn. [Bəhlul:] *Baş mühəndis* [Qaraxalovu] *sıxışdırırdı*. B.Bayramov. // Sıxışdırıb aradan çıxarmaq, təzyiq etmək, təsir etmək. *İbrahim xanı sıxışdırmaq yaxın tədbirlərdən biri idi.* Çəmənzəminli.

**SIXIŞMA** "Sıxışmaq"dan *f.is.*

**SIXIŞMAQ** *f.* Yan-yana gəlib bir-birinin təzyiqi altında olmaq, bir-birini sıxmaq, sıxışdırmaq.

**SIXLAŞDIRILMA** "Sıxlaşdırılmaq"dan *f.is.*

**SIXLAŞDIRILMAQ** *məch.* Daha sıx edilmək, daha sıx hala gətirilmək, birləşdirilmək.

**SIXLAŞDIRMA** "Sıxlaşdırmaq"dan *f.is.*

**SIXLAŞDIRMAQ** *f.* Daha sıx etmək, sıx hala gətirmək, birləşdirmək, lap yaxınlaşdırmaq.

**SIXLAŞMA** "Sıxlaşmaq"dan *f.is.*

**SIXLAŞMAQ** *f.* 1. Getdikcə sıx olmaq, sıx hala gəlmək; kəsifləşmək, qatılaşmaq, qəlizləşmək. *Göy üzündə... qara buludlar sıxlaşır, yavaş-yavaş yağış çisələyirdi.* Ə.Vəliyev. *Sıxlaşdı qaranlıq... gəldi çən, duman; Çəkildi üfüqdən Elbrus tamam.* N.Xəzri.

2. Bir-birinə lap yaxın durmaq, qovuşmaq, çox sıx dayanmaq. *Məşədibəy cavab vermədi, onun üzündəki qırışlar daha da sıxlaşdı.* M.Hüseyn.

3. *məc.* Birləşmək, həmrəylik, birlik yaratmaq, birgə hərəkət etmək üçün bir araya toplaşmaq. *Partiya sıraları döyüşlərdə sıxlaşan; Dənizlər, dağlar aşan; Müzəffər bir ordudur.* Ə.Cəmil. *Kəndlilər sıxlaşmağa başladılar*. Ə.Vəliyev.

**SIXLIQ** *is.* Sıx şeyin halı; bir-birinə çox yaxın olma, bitişik olma. // Qalınlıq. *Meşənin sıxlığı*.

**SIXMA** "Sıxmaq"dan *f.is.*

◊ **Bir sıxma** – bir atım, bir çimdik. *Xatun qayıdıb içəriyə girdi, xörəyə baxıb bir balaca sıxma duz atdı*. S.Rəhimov.

**SIXMA-BOĞMA** *is.* Bir-birini sıxma, sıxışdırma, basabas. [Əliqulu:] *Sonra yavaş-yavaş sıxma-boğma başlandı*. S.Rəhman. *Bu sonsuz sıxma-boğmaya daha nə qədər dözmək olar*. İ.Hüseynov.

◊ **Sıxma-boğmaya salmaq** – çox sıxışdırmaq, çıxılmaz vəziyyətə salmaq. [Pərişan:] *Telli xala kimi ağbirçəklər milçəkdən dəvə qayıranda yazıq kişilər neyləsin, qulaqlarına çatır, arvadı salırlar sıxma-boğmaya*. M.İbrahimov. *Sona .. içəridə əmisi arvadını sıxma-boğmaya salanlara da eşitdirmək istəyib bərkdən dedi*. Ə.Əbülhəsən.

**SIXMAQ** *f.* 1. Üstündən, ya yanlarından basmaq, təzyiq etmək. *Qarpızı sıxıb yoxlamaq.*

2. Kip birləşdirmək, bir-birinin üstünə bərk basmaq, qısmaq. *Cavan müəllim .. susdu, dişlərini bir-birinə sıxdı, gözləri isə çox şeylər söyləyirdi.* M.Rzaquluzadə. □ **Əlini sıxmaq** – salamlama və ya başqa bir hissini (təşəkkür, hüsn-rəğbət, razılıq və s.) ifadə etmək üçün birinin əlini tutub bərk sıxmaq.

3. Meyvəni əl və s. ilə bərk basıb (sıxıb) suyunu çıxarmaq. *Üzüm sıxmaq. Meyvə sıxmaq. Limon sıxmaq.* // Bərk buraraq suyunu çıxartmaq. *Paltarları sıxmaq. – Kimi dolaqlarını açıb, çəkmələrini çıxarır, kimi patavalarını sıxıb yenə də yaş-yaş geyirdi.* Ə.Vəliyev.

4. *məc.* Sıxışdırmaq, ruhən incitmək, sıxıntı vermək. *Belə hərəkət adamı sıxır. – Məni çox*

*dərin bir kədər pəncəsinə alıb sıxmağa başladı.* M.S.Ordubadi. *Bilirəm, könlünü sıxır iztirab; Keçən məktubuna verirəm cavab.* M.Rahim. *Bəlkə mənim bu ziyarətlərim Yaqutu və gənc doktoru sıxırdı?* Ə.Məmmədxanlı.

5. Tətiyi çəkib boşaltmaq (odlu silahı). [Bahadır] *bu sözləri yazandan sonra tapançanı gicgahına qoyub sıxdı...* N.Nərimanov. *..Kəblə Abbasəli aşpazxananın səqfinə iki güllə sıxdı.* Mir Cəlal.

6. Dar gəlmək, dar olmaq (paltar, ayaqqabı). *Tufli ayağımı sıxır.*

7. Bərk çəkib bağlamaq. [Gülbadam] *boynuna düşmüş ağ çit, qara çiçəkli yaylığı başına salıb, boğazının altından sıxdı.* N.Nərimanov.

◊ **Sıxıb suyunu çıxartmaq** *məc.* – bərk sıxışdırmaq, bərk tənqid etmək, abrını vermək. *Çünki Qoşatxan büro iclaslarının birində* [Rüstəmin] *də sıxıb suyunu çıxartmışdı.* M.İbrahimov. [Şofer:] *Qayda-qanunu nə tez unutdun, ay Yusif? Bəs demirsən sessiyada sıxıb suyunu çıxartdılar?* B.Bayramov.

**SIX-SIX** *zərf* və *sif.* 1. Çox sıx, bir-birinə çox yaxın, bitişik. *Sıx-sıx kollar. Ağaclar sıx-sıx əkilmişdir.*

2. Tez-tez, hər addımda. *Belə hallara sıx-sıx təsadüf edilir.*

**SIXYARPAQ(LI)** *sif.* Yarpaqları sıx olan. *Sıxyarpaqlı ağac.*

**SILDIRIM** *sif.* Çılpaq, dik və uca; yalçın. *Sıldırım dağ.* – [İskəndər bəy] *sıldırım bir qayanın başında laçın yuvasına bənzər, ağ daşdan bina olunmuş ikimərtəbəli sarayında oturub hər tərəfə fərman göndərərdi.* Ə.Haqverdiyev. *Xoş gəldin söyləyir yenə şairə; Sinəsi sıldırım qayalı dağlar.* S.Rüstəm. // Sıldırımlı. *Biz sıldırım və çətin bir yol ilə gedirik.* M.İbrahimov. // *is.* Dik qaya. *Uşaqlığım uçurumlar, sıldırımlar arasında keçmişdi.* İ.Əfəndiyev. *Nərgizin fikri .. qanad çalır, sıldırımlarda dayanan ağacların .. yanında süzürdü.* B.Bayramov. // Uçurum, yarğan. [Koroğlu] *atı vurub sıldırımın kənarına gəldi.* "Koroğlu".

**SILDIRIMLI** *sif.* 1. Sıldırım olan, sıldırım halında olan. [Ağbulaq kəndi] *sıldırımlı dağların geniş ətəyində yerləşərək hər tərəfdən meşə ilə əhatə olunmuşdu.* S.Rəhimov.

2. Uçurumlu. *Sıldırımlı sahil. Sıldırımlı dərə.*

**SIMSIQ, SIMSIRIQ: sımsığına dəymək** – b a x **damağına dəymək** ("**damaq**"da). [Xurşid:] *Srağagün* [Gülsabah] *orada oturmuşdu, mən də .. çıxdım getdim. Bu* [Gülsabahın] *sımsığına dəyib.* C.Cabbarlı. **Sımsığını (sımsırığını) sallamaq** – b a x **qaş-qabağını sallamaq** ("**qaşqabaq**"da). [Cəbi:] *O arvaddan həzər etmək gərək, hansı ki əri evə gələndə sımsığın sallaya..* N.Vəzirov. *Tapdıq sımsırığını salladı, bir müddət küsdü.* Ə.Vəliyev.

**SINAQ** *is.* Sınama işi, imtahan. *Söhbətin bu yerində mən sınaq üçün xalça üstündə oynayan qızı çağırdım.* S.Rəhimov. [Əlikram:] *Səlim, ..bilirsən ki, yaradıcılıq böyük sınaqlar tələb edir.* B.Bayramov. ☐ **Sınaqdan keçirmək** – sınamaq, yoxlamaq, imtahandan keçirmək. *Varaz oğlunun da cəsarətini bəyəndi, amma onu daha çətin bir sınaqdan keçirmək istədi.* M.Hüseyn. [Fərrux] *mollanın ağzını yoxlamaq, sınaqdan keçirmək üçün tədbir tökürdü.* Ə.Vəliyev. **Sınaqdan (sınaqlardan) keçmək (çıxmaq)** – yoxlanmaq, sınanmaq, imtahandan keçmək. *Bu rota böyük sınaqlardan çıxmışdı.* S.Vəliyev. *Həyat yolunda, yaxşılıq uğrunda bütün sınaqlardan keçməyə hazıram, sevincdən üz döndərmirəm, qəm-qüssədən qorxmuram.* Ə.Məmmədxanlı.

**SINAQÇI** *is.* Aparatları, materialları və s.-ni sınaqdan keçirən mütəxəssis. *Sınaqçı təyyarəçi. Sınaqçı şofer.*

**SINAQLI** *sif.* Təcrübəli, sınaqdan çıxmış. *Vaqifin sınaqlı gözləri arvadına rast gələrək parladı.* Çəmənzəminli. *Səngərdən-səngərə verirlər xəbər; Seçirlər üç nəfər sınaqlı rəhbər.* H.K.Sanılı.

**SINAMA** "Sınamaq"dan *f.is.*

**SINAMAQ** *f.* Yoxlamaq, təcrübədən, sınaqdan keçirmək. [Əhməd:] *Qızım, mənim nə oğlum var, nə də qızım, səni sınayırdım, xatircəm ol, Qəribini tapıb sənə yetirərəm.* "Aşıq Qərib". [Elxan yoldaşlarına:] *Qardaşlar, taleyimizi sınayaq.* C.Cabbarlı. [Əsgər:] *Mən də qəsdən demədim ki, qoy axıra kimi qızı sınayım.* Ü.Hacıbəyov.

**SINAN(IL)MA** "Sınan(ıl)maq"dan *f.is.*

**SINAN(IL)MAQ** *məch.* Sınaqdan keçirilmək (çıxarılmaq), yoxlanılmaq, təcrübədən keçirilmək. *Adamlar təcrübədə sınanmalıdır.*

Ə.Əbülhəsən. *Hüseyn yoldaşını qoyarmı darda; Sədaqət sınanıb vuruşmalarda*. M.Rahim.

**SINANMIŞ** *f.sif.* Sınaqdan çıxmış, təcrübədən keçirilmiş, yoxlanmış. *Döyüşdə sınanmış mərd əsgər kimi; Ellər vəhdətinə səs verək bu gün.* M.Rahim. *Burda çox sınanmış şerin hünəri; Bura ilham yurdu sənət şəhəri*. N.Rəfibəyli.

**SINAYICI** *sif.* Sınayan, bilmək istəyən, imtahanedici, sual ifadə edən. *Mahmud .. ananın sınayıcı baxışlarının mənasını başa düşdü.* Ə.Əbülhəsən. *Polkovnik sınayıcı nəzərlə* [kapitana] *baxdı*. S.Vəliyev.

**SINDIRMA** "Sındırmaq"dan *f.is.*

**SINDIRMAQ** *f.* 1. Bərk bir şeyə vurmaqla, toxundurmaqla, yaxud yerə salmaqla parçalamaq, qırıb tökmək. *Stəkanı yerə salıb sındırmaq. Su dolçasını sındırmaq. Güzgünü sındırmaq. – ..Birdən gülümü üzdüm, tacımı daşa vurdum, ..sındırdım.* A.Divanbəyoğlu. *Noldu, ehtiyatsız yenə dolandın; Bulaqda küzəni sındırdın dünən*. N.Xəzri. // Bütöv bir şeyi bərk bir şeyə vuraraq xıncım-xıncım etmək, qırmaq. *Daş sındırmaq*.

2. Qopararaq üzmək, qırmaq. *Şaxı sındırmaq*. *Stolun qıçını sındırmaq*. *– Getdi meşə içrə odun qırmağa; Şax budağı başladı sındırmağa.* A.Səhhət. [Güllü:] *Mən daha budaq sındırmayacağam*. H.Seyidbəyli.

3. Korlamaq, xarab etmək, yararsız hala salmaq. *Saatı sındırmaq. Oyuncağı sındırmaq. Aləti sındırmaq*.

4. Şikəst etmək, qırmaq. *Qolunu sındırmaq. Ayağını sındırmaq. – Molla bir uşağın ayaqlarını falaqqaya qoyanda on bir çubuq sındırır.* C.Məmmədquluzadə. [Hambal:] *A Məşədi, bu qədər xəlqə pul paylayırsan, mənə də bir abbası ver, belimi sındırıbsan.* Ü.Hacıbəyov.

5. *məc.* Məhv etmək, yox etmək, məğlub etmək, dağıtmaq. *Köhnəlmiş idarə üsulunu sındırıb yenisini qurmaq. – Qoşun sındırmış, qala fəth etmiş əsgər sevinci ilə Durmuş yatağına girdi.* Mir Cəlal.

6. *məc.* Pərt etmək, xətrinə dəymək, məyus etmək. *Səlim* [Naşadı] *son sözilə məclisdə sındırmışdı.* S.Hüseyn. *Bu gülüşlər də onu sındırmışdı.* H.Nəzərli. *Yoldaş komandir! Gəlin siz məni sındırmayın, mənim də taytuşum var.* Ə.Vəliyev.

7. *məc. dan. zar.* Həvəslə, şövqlə oynamaq (rəqs etmək). [Kərbəlayı Fatmanisə:] *Vallahı, zalımın qızı elə sındırır ki, elə sındırır ki, bütün sümükləri beşatılan kimi şaraq-şaraq şaqqıldayır.* C.Cabbarlı. ☐ **Sındıra-sındıra oynamaq** – həvəslə, ehtirasla, şövqlə oynamaq. *Gələnlərdən iki nəfəri ortada sındıra-sındıra oynayırdı*. M.Hüseyn.

8. Bir sıra isimlərin yanına gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ürəyini sındırmaq, sözünü sındırmaq, başını sındırmaq, qol-qanadını sındırmaq, belini sındırmaq və s.

**SINIXMA** "Sınıxmaq"dan *f.is.*

**SINIXMAQ** *f.* Zəifləmək, arıqlamaq, ətini tökmək, üzülmək, ərimək. *Kiçikbəyimin .. solğun çöhrəsi sınıxmışdı və dərin bir kədər saçırdı.* Çəmənzəminli. *Züleyxa bir tərəfdən ərinin rəftarını, digər tərəfdən qardaşının zəlalətini görüb günü-gündən sınıxırdı.* C.Cabbarlı. [Çəpəl:] *Qız, bu nə gündür, sınıxıb əriyibsən?* Mir Cəlal.

**SINIQ** *sif.* 1. Sınmış halda olan; qırıq. *Sınıq dolça. Sınıq boşqab. Sınıq güzgü. Sınıq maşın. – Mirbalayev oturduğu sınıq taburetdən qalxaraq gəzinməyə başladı.* M.Hüseyn. *Dağınıq və uçuq evləri, küçələrə tökülmüş sınıq qab-qacaqları görərkən dağılmış insan yurdunun bu xarabazarlığı qarşısında yolçunun ürəyi sıxıldı*. Ə.Məmmədxanlı.

2. *is.* Sınmış, qırılmış bütöv bir şeyin kiçik hissəsi. *Stəkan sınığı. Maşının sınıqlarını düzəltmək. Qabların sınığını atmaq.*

3. *məc.* Pərişan, qüssəli, dərdli. [Şükür] *sınıq bir ürəklə kəndə qayıtmağa məcbur olmuşdu.* S.Hüseyn. *Acı qəmlərlə onun qəlbi sınıq, ruhu sınıq; Ona rəhm eyləyən əllər hanı? Olmuşmu qırıq?* M.Müşfiq. [Sona:] *Ay oğul! Gözümə bir az sınıq dəyirsən?* Z.Xəlil.

4. İflas etmiş, müflis.

5. *məc.* Məğlubiyyətə uğramış, basılıb pozulmuş. *Sınıq qoşun.*

◊ **Sınıq çıxmaq** – iflas etmək, müflis olmaq. *Nəhayət, Hacı Sultan sınıq çıxdı*. S.Hüseyn. *Həmzə sınıq çıxıb iflas etmiş* "*intiligent*" *tacir və əmisi oğlu Ağasəfəri öz yanında işə götürmək niyyətində idi.* Ə.Əbülhəsən. **Sınıq düşmək** – 1) b a x **sınıq çıxmaq**; 2) məğlub olub dağılmaq, darmadağın olmaq. *Sınıq dü-*

*şən Səlim bəy suyu süzülənə-süzülənə Gorusa qayıdıb, istər-istəməz Peterburqa bir də xəbər yazdı*. S.Rəhimov. **Sınıq salmaq** – dağıtmaq, basmaq, məğlub etmək, darmadağın etmək. *Nəbi dağın bir tərəfində olan qoşunu sınıq salıb, dərə enişə qovdu*. "Qaçaq Nəbi".

**SINIQÇI** *is*. Çıxmış və ya sınmış sümüyü yerinə sala bilən arahəkimi. *Biçarə qolunun ağrısından bitab düşüb, nəhayət, məşəqqətlə özünü sınıqçı Kərbəlayı Piriyə yetirdi*. S.M.Qənizadə. *Sınıqçı dalınca gedən atlı alçaqboy, qırmızısaqqal qoca bir kişi ilə qayıtdı*. P.Makulu.

**SINIQÇILIQ** *is. köhn*. Sınıqçının işi, peşəsi, sənəti. *Sınıqçılıq eləmək*.

**SINIQLIQ** *is*. 1. Sınıq şeyin halı, qırıqlıq.

2. Sümüklərdə, oynaqlarda, damarlarda küt ağrı; əzginlik, yorğunluq hissi. *Mədəd işləyir, çalışır, heç bir işdən geri qalmır, ancaq yenə də özündə bir sınıqlıq hiss edirdi*. S.Rəhimov.

**SINIQ-SALXAQ** *sif. dan*. Yarı sınıq, yarı sökülmüş; köhnəlmiş, yıpranmış, yararsız. *Sınıq-salxaq yeşik. Sınıq-salxaq ev. Sınıq-salxaq körpü*. – *Xədicə bu sınıq-salxaq faytonun xatirinə hər zülmə dözürdü*. S.Rəhman. *Ətraf evlərdə yaşayanlar öz sınıq-salxaq daxmalarını tərk edirlər*. H.Seyidbəyli.

**SINIQ-SINIQ** *sif*. və *zərf* Sınıq, qırıq (çoxları haqqında). *Sınıq-sınıq qablar. Boşqablar sınıq-sınıq olmuşdur*.

**SINIQ-SÖKÜK** b a x **sınıq-salxaq**. *Sınıq-sökük divar. Sınıq-sökük daxma*. – *Yan küçədə sınıq-sökük darvazaya çəkmə şəkilli iri bir lövhə çalınmışdı*. Çəmənzəminli. // *is*. Dağılmış, sökülmüş, yıxılmış, uçulmuş ev, bina və s. [İmran:] *Hamı sınıq-söküklər kəndinizin içərisində düzələcəkdir*. Ə.Haqverdiyev.

**SINIRMAQ** *f*. Hüdudlaşdırmaq, məhdudlaşdırmaq.

**SINMA** "Sınmaq"dan *f.is*.

**SINMAQ** *f*. 1. Bir şeyə bərk toxunaraq parçalanmaq, tikə-tikə olmaq, xırda hissələrə ayrılmaq; qırılmaq, zədələnmək. *Boşqablar əlimdən düşüb sındı. Pəncərə sınıb töküldü*. – *Su səhəngi suda sınar*. (Ata. sözü). ..*Əli yumurtasının künəsini tutur və deyir: – Vur! Vəli vurmur, bilir ki, yumurtası sınacaq*. C.Məmmədquluzadə. *Gəminin şüşə-pəncərələri cingilti ilə sınıb töküldü*. M.Rzaquluzadə. // Ağır bir şeyin təzyiqi altında əyilərək yerindən qopmaq, qırılmaq. *Küləkdən ağacın budaqları sındı*. // Bərk bir şeyə şiddətlə dəyərək, toxunaraq şikəst olmaq; qırılmaq, zədələnmək. *Ayağı sınmaq. Qolu sınmaq*. – [Hambal:] *Məşədi, belim sınıbdır, bir abbası da verəcəksən*. Ü.Hacıbəyov.

2. *məc*. İncimək, xətrinə, qəlbinə dəymək, pərt olmaq. *Xan, şahın bu təhqirli məktubundan sınmadı*. Çəmənzəminli. *Uzaqdan çaparın Mirzə Valehsiz qayıtdığını görən Yədulla xan bərk sındı və çox pərt oldu*. S.Rəhimov. *Qulam dayı sınmadı, nağılını söyləməyə davam etdi*. M.Hüseyn.

3. Basılmaq, məğlub olub dağılmaq, müqavimət qabiliyyətini itirmək. *Düşmən qoşunu sınıb qaçandan sonra Nəbi dəstəsiynən Telli qarının meyiti yanına gəldi*. "Qaçaq Nəbi". *Ən əvvəl Gamışvan tərəfindən hücum edən Maku ordusu sındı*. M.S.Ordubadi.

4. Azalmaq, zəifləmək, yenmək. *Quyruq doğandan bir həftə sonra idi. Nədənsə istilər hələ sınmamışdı. Gün günortadan əyilsə də hava sərinləşmirdi*. Ə.Vəliyev. *Yavaş-yavaş hava sınır*. B.Vahabzadə.

5. *məc*. Aşağı düşmək, enmək. *Qiymətlər sındı*.

6. *məc*. İflas etmək, müflis olmaq.

7. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ürəyi sınmaq, könlü sınmaq, canına sınmaq, qol-qanadı sınmaq və s.

**SIPA** *is*. Bir yaşar qoduq (bəzən söyüş yerində işlənir).

**SIRA** *is*. 1. Yan-yana və ya ard-arda duran adamlar və ya şeylər düzümü; səf, cərgə. *Evlər sırası. İki sıra durmaq*. – [Uşaqlar:] *Sıralara duraq biz; İrəliyə, irəliyə; Yeni dünya quraq biz*. C.Cabbarlı. [Xasay] *sırada dayandı. Sıra nömrəsini saydı*. Ə.Vəliyev. // Kinoda, teatrda və s.-də oturmaq üçün bir xətdə düzülmüş yerlər. *Qabaq sırada oturmaq. Yerimiz dördüncü sıradadır*. – *Birinci sırada makinalara buraxılmış xam dəmir parçaları son sıralarda hazır avtomobil olaraq vaqonlara yüklənirdi*. Çəmənzəminli. *Qurultayın birinci iclasında təsadüfimi və ya bilərəkdənmi Eldar* [Ceyranın] *arxasındakı sırada oturur*. S.Hüseyn.

2. Bu və ya başqa bir münasibətlə, ya təşkilati cəhətcə bir arada birləşən adamlar toplusu; heyət. – [Fərman] *həmişə bu yerlərin gələcəyini, sabahını görür və sabahı yaradanlar sırasında olması ilə fəxr edirdi.* Ə.Sadıq. [Məzlum:] *Məni sıranızdan pozun.* S.Vəliyev.

3. *coğr.* Cərgə, silsilə. *Qarlı dağlar sırası. – Budur önümdədir təpəsi qarlı; Qafqazın möhtəşəm sıra dağları.* M.Rahim.

4. Növbə. *Sırası gəldikcə. İndi sizin sıranızdır. Mənim sıram hələ gəlməyib.*

5. Sinif, dərəcə, cərgə, mərtəbə, rütbə, zümrə. *Bizi onların sırasına daxil etməyin.*

6. Adətən "bir" sözü ilə: **bir sıra** – bir çox, bir miqdar, çoxlu, yaxud bir qədər, bəzi. *Bir sıra məsələ. Bunun bir sıra səbəbi var. Oxuculardan bir sıra məktub gəlmişdir.*

◊ **Sıradan çıxartmaq** – korlamaq, xarab etmək, işləməz, yararsız hala salmaq. *Maşını sıradan çıxartmaq.* – [Sultan:] *Lap açıq demişəm ki,* [Qoşqar], *səni sıradan çıxartmaq üçün Sultan Əmirlinin kifayət qədər gücü də var idi.* İ.Hüseynov. **Sıradan çıxmaq** – korlanmaq, xarab olmaq, daha işə yaramamaq, işləyə bilməmək. *Maşın sıradan çıxmışdır.* **Sıradan qalmamaq** – hamı ilə birgə hərəkət etmək, yoldaşlarından geri qalmamaq, ayaqlaşmaq. *Oğul-uşaq zoğal, fındıq, moruq dərməyə gedərkən Kərim baba da sıradan qalmazdı.* A.Şaiq. **Sırası gəldikcə** – yeri gəldikcə, növbəti gəldikcə. **Bu sırada** – bu vaxt, bu arada, bu zaman, bu anda. *Bu sırada Rüstəm bəy də artıq gülməyə başladı.* Çəmənzəminli. *Bu sırada yaxında dörd-beş əl şiddətli tapança atılır.* H.Cavid. *Bu sırada zavallı mühəndisin gözlüyü də gözündən düşdü.* B.Talıblı. **O sıradan** – o cümlədən. *Qurultayın böyük tərbiyəvi əhəmiyyəti daha yaxından ədəbiyyatın və o sıradan dramaturgiyanın yeni yüksək pillələrə qalxmasına yardım edəcək, geniş imkanlarla özünü göstərmiş olacaqdır.* C.Cabbarlı.

**SIRACA** *is.* b a x **xanazır**.

**SIRALAMA** "Sıralamaq"dan *f.is.*

**SIRALAMAQ** *f.* Sıraya düzmək, sıraya qoymaq, sıra-sıra düzmək, sıra halına gətirmək.

**SIRALANMA** "Sıralanmaq"dan *f.is.*

**SIRALANMAQ** *f.* Bir-birinin yanınca sıra ilə dal-dala düzülmək, sıra ilə düzülmək. *Natiq .. sıralanıb baxan uşaqları göstərdi. – Bunlar, – dedi, – bu yeni nəsil səadət üçün, həyat və işıqlıq üçün doğulmuşdur.* Mir Cəlal. *Fabriklər, zavodlar sıralandı yan-yana; Xoşbəxt həyat verməkçün azad olmuş insana.* R.Rza.

**SIRALANMIŞ** *f.sif.* Bir-birinin yanınca sıra ilə düzülmüş. *Lakin getdikcə Şirzad, Nəcəf və başqaları susaraq kənddəki səliqəyə, cərgə ilə sıralanmış evlərə, onların dal tərəfində uzanan bağçalara baxırdılar.* M.İbrahimov.

**SIRALI** *sif.* Sıra ilə olan, sıra ilə düzülmüş, sıralanmış. *Sıralı dağlar.*

**SIRASIZ** *sif.* Sırada olmayan; qaydasız, nizamsız.

**SIRATAĞ** *is. memar.* Dirəklər və ya sütunlar üzərində duran tağlar sırası.

**SIRAVİ** *sif.* Rəhbər işdə olmayan, başqalarından fərqlənməyən; adi. *Sıravi fəhlə. – Mollayev tək-tək nüfuzlu dostlarına arxalandığı halda, Aslanov saysız-hesabsız sıravi, sadə adamların gücünə söykənirdi.* M.Hüseyn. [Bənövşə:] *Sən burada sıravi mühəndis də işləmək istəmirsən?* S.Rəhman. // Komanda heyətinə mənsub olmayan, adi. *Mən sıravi bir əsgərəm xoşbəxt ana Vətənimdə.* S.Rüstəm. *Az bir müddətdə bütün orduda yüzlərlə sıravi .. əsgər komanda heyətinə irəli çəkilmişdir.* M.İbrahimov.

**SIRF** *sif.* Xalis, məhz, ancaq, büsbütün. *Sırf yalan. Sırf böhtan. – Mən heç vaxt damdandüşmə deməmişəm ki, .. hicab yoxdur. Bu söz mən Molla Nəsrəddinin barəsində sırf böhtandır.* C.Məmmədquluzadə. *Qulu təhsilə sırf tüccari bir zehniyyətlə getmişdi.* "*Oxumaq, qazanmaq, sərvət sahibi olmaq*" – *onun birinci şüarı idi.* Çəmənzəminli.

**SIRĞA** *is.* Qadınların qulaqlarına taxdıqları qızıl, gümüş və s.-dən qayrılmış müxtəlif formalı bəzək; tana. *Brilyant sırğa. Yaqut sırğa. – Ərknaz heç kəsin ağlına gəlməyən sırğalar, klonlar, qolbaqlar, bilərziklər, boyunbağılar, sancaqlar sifariş elərdi...* M.Hüseyn. [Sara xanımın] *..sırğası, qozası, ətəkliyi, nəyi, nəyi yox idi?* Qantəmir.

◊ **Qulağında sırğa olmaq** – b a x **qulaq**.

**SIRĞACIQ** *is.* Balaca sırğa, kiçik sırğa. *Qızın qulağına sırğacıq taxmaq.*

**SIRĞALIQ** *is.* Qulağın ət halında olan aşağı hissəsi; mərçək.

**SIRIQ** *is.* Paltara, yorğana və s.-yə atılan iri və möhkəm tikiş. *Döşəyin sırığı açılıb. Paltonun sırıqları bilinir. – Aradan onun sırıq alt köynəyinin qırmızı sapla işlənmiş sırıqları görünürdü.* S.Rəhimov.

**SIRIQLI** 1. *sif.* Sırıq vurulmuş, sırıq atılmış. *Sırıqlı paltar. –* [Rəiyyətin] *isti-soyuqdan saxlayan motal papağı, bir də döşü sırıqlı, ətəyi büzməli arxalığı var idi.* S.Rəhimov. [Əsgər bəy] *sarı, ipək arxalığının sırıqlı boğazının cılıqqalarını açdı.* Ə.Vəliyev.

2. *is.* Gödəkcə, candonu. *Sırıqlı tikdirmək. – Şofer əynindəki sırıqlını çıxarıb* [Aydının] *dalınca qışqırdı.* H.Seyidbəyli. [Firəngiz Şahinə:] *Əgər sən üşüyürsənsə, götür sırıqlını gey...* B.Bayramov.

**SIRIMA** 1. "Sırımaq"dan *f.is.*

2. B a x **sırıqlı** 1-ci mənada. *Bu adamlar* (*şəhərin alverçi, baqqal, tacir, dəllalları*) *çiyinlərinə güləbətinli sırıma ilə baftalı çuxa .. salardılar.* H.Sarabski.

**SIRIMAQ** *f.* 1. Arasına (içinə) yun, pambıq qoyulmuş mitili və s.-ni iri tikiş ataraq tikmək. *Yorğança sırımaq. Döşək sırımaq.* – [Gülcahan:] *Vay, yorğanı sırıyanda yaddan çıxıb* [qayçı] *içində qalıbdır.* T.Ş.Simurq. *..Əlində təzə yorğan sırıyan arvad ərinə müraciət elədi.* Ə.Abasov.

2. *məc. dan.* Zorla və ya aldatma yolu ilə qəbul etdirmək, almağa məcbur etmək. [Ələsgər:] *Bir vədə var idi, arşını beş şahıya satdığın çiti Hacıya iki abbasıya sırıyırdın.* Ə.Haqverdiyev. [Mirzə Cəlil:] *Əsgər bəy yüz gədənin artığı baldızını mənə sırımaq istəyir.* Ə.Vəliyev.

**SIRINMA** 1. "Sırınmaq"dan *f.is.*

2. B a x **sırıqlı** 2-ci mənada. *Yunis sırınmanı alıb əyninə taxmamış Davud kəndiri belinə bağladı.* Mir Cəlal.

**SIRINMAQ** *məch.* Sırıq vurulmaq, sırıq atılmaq. *Döşək sırınıb qurtardı.*

**SIRMA** *is.* 1. Qızıl kimi parlayan incə gümüş tel.

2. Əsgəri rütbələri bir-birindən ayırmaq üçün rəsmi paltarların qollarına, boyunlarına və s.-yə tikilən fərqlənmə nişanı. *Bir də rəfiqlərindən biri deyirdi ki, Ağa Əli xan yazıb, məndən yaranal sırması və şaşka istəmişdi.* Çəmənzəminli. // Ümumiyyətlə, bəzək üçün paltarın və s.-nin üstündən tikilən şey.

**SIRMALAMA** "Sırmalamaq"dan *f.is.*

**SIRMALAMAQ** *f.* Sırma tikmək, sırma ilə bəzəmək. *Köynəyi sırmalamaq.*

**SIRMALI** *sif.* Sırması olan, sırma tikilmiş, sırma ilə işlənmiş və ya bəzədilmiş. *Sırmalı köynək.*

**SIRSIRA** *is.* Axmaqda olan su damcılarının donması nəticəsində əmələ gələn buz lülələri. *Daşın kənarı sırsıra bağlamışdır. – Arada hava ayazıyıb açılanda ağaclardan sırsıra tərpənib töküləndə adamlar balta, dəhrəsini götürür..* S.Rəhimov. *Külək əsir; Şaxta kəsir; Pərdilərdən asılmışdır sırsıralar.* R.Rza.

**SIRT**[1] *is.* Bel, kürək. *Sırtına bir-iki tutarlı dartdı; Qolundan yapışıb, irəli atdı.* H.K.Sanılı. *Haydı, minib sırtına yel gedişli atların; Yerdə, göydə, dənizdə oynasın qanadların.* M.Müşfiq. *Suyu tamam çəkilməmiş xalçanın saçaqlarından süzülən iri damlalar onun enli sırtını, buğumlu topuqlarını isladırdı.* İ.Hüseynov.

**SIRT**[2] *is. məh.* Yamac üstü, uzanan təpəliyin üstü.

**SIRTIQ** *sif.* Utanmaz, həyasız, arsız, üzlü; özünü hər yerə soxan, heç şeydən utanmayan. [İsfəndiyar:] *Mənim sırtıq adamdan xoşum gəlmir.* Ə.Vəliyev. [Teymur:] *Axı nəyi bilirsiniz? Mən sırtıq adam olsaydım, bütün günü ac qalmazdım.* M.Hüseyn. // İs. mənasında. [Gülməli:] *Mənim bir adamın sırtığından zəhləm gedir, bir də mozalan tutmuş danadan.* Ə.Abasov.

**SIRTIQLAŞMA** "Sırtıqlaşmaq"dan *f.is.*

**SIRTIQLAŞMAQ** *f.* Daha da sırtıq olmaq; həyasızlaşmaq, arsızlaşmaq. *Uşaq döyüldükcə sırtıqlaşar.*

**SIRTIQLIQ** *is.* Utanmazlıq, həyasızlıq, abırsızlıq, arsızlıq; sırtıq adamın xasiyyəti. *Mayanın üzündə və gözlərində heç bir biclik, sırtıqlıq və ya bayağılıq yox idi.* M.İbrahimov.

**SIRTILMA** "Sırtılmaq"dan *f.is.*

**SIRTILMAQ** b a x **sırtıqlaşmaq**.

**SISQA** *sif.* Cılız, çox zəif, çox arıq. *Səttar kişinin yanında oturan topsaqqal, amma buradakıların hamısı kimi sısqa bir kişi sözə qarışdı.* Ə.Əbülhəsən. [Qəndab:] *Onların*

*yanında doğrudan da sısqa uşağa oxşayırdım*. B.Bayramov. // Məc. mənada. *Payızın sısqa yağışını da, çillənin amansız soyuğunu da eyni həvəslə təriflərdi*. M.İbrahimov. *Suçular əkini dərin şırımla və sısqa axınla suvardılar*. Ə.Vəliyev. *Bir az yuxarıda üstünü xəzəl basmış, lakin nazik budaqlarını göyə uzadan, yaşamaq istəyən sısqa kollar görünür.* Mir Cəlal.

**SISQALAŞMA** "Sısqalaşmaq"dan *f.is.*

**SISQALAŞMAQ** *f.* Getdikcə zəifləmək, sısqa olmaq, arıqlamaq, cılızlaşmaq.

**SISQALIQ** *is.* Cılızlıq, arıqlıq, zəiflik.

**SISLAMAQ** *f.* Təpinmək, üstünə qışqırmaq.

**SITQAMAQ** *f.* Ağlamaq, sızıldaya-sızıldaya ağlamaq, inləmək.

**SIYIQ** 1. *sif.* Yarıduru halda olan; horra. *Sıyıq məhlul. Sıyıq gil. – Tüfəng açılan kimi, onun səsindən ürkən eşşək bir qoşa şıllaq atdı və "ovçu" aşıb başı üstə sıyıq palçığın içinə düşdü*. M.Rzaquluzadə.

2. *is.* Südlə və ya su ilə bişirilən duru xörək; qaşıqaşı, sıyıqaşı. *Düyü sıyığı. Darı sıyığı. Ətli sıyıq.*

**SIYIQAŞI** b a x **qaşıqaşı**.

**SIYIQLAŞDIRMA** "Sıyıqlaşdırmaq"dan *f.is.*

**SIYIQLAŞDIRMAQ** *f.* Daha da sıyıq etmək, yaxud qatı halda olan şeyi sıyıq hala salmaq; durulaşdırmaq. *Palçığı sıyıqlaşdırmaq.*

**SIYIQLIQ** *is.* Sıyıq şeyin halı, xassəsi, keyfiyyəti; duruluq (*qatı* ziddi). *Məhlulun sıyıqlığı. – Şorbanın sıyıqlığı dənin azlığındandır.* (Ata. sözü).

**SIYIQVARİ** *sif.* Suyu çox olan, sıyığaoxşar, sıyıq kimi, horra kimi. *Sıyıqvari məhlul. Sıyıqvari palçıq*.

**SIYIRIM, SIYIRINTI** *is.* Sıyrılmış, sıyrılıb qopmuş, dərisi qopmuş (yıxılaraq, bir şeyə dəyərək). *Üzünün sıyırıntısı görünür. Qolundakı sıyırıma yod sürtmək.*

**SIZAĞAN** *is.* Sızan, sızıb keçən su, maye.

**SIZAQ** b a x **sızanaq**. *Üzünü sızaq basmaq.*

**SIZANAQ** *is.* Dəri üzərində əmələ gələn irinli səpgi. *Bədənini sızanaq basmaq. Sızanaq çıxarmaq*.

**SIZI** *is.* b a x **sızıltı**. *Bütün vücudumda bir qırıqlıq, bir sızı hiss edirəm.* A.Şaiq.

**SIZILDAMA** "Sızıldamaq"dan *f.is.*

**SIZILDAMAQ** *f.* 1. Yüngülcə ağrımaq, sızı vermək. *Sümüklərim sızıldayır. Dişi sızıldamaq. – Zeynəb bucaqda ayaq üstə durmaqdan lap yoruldu. Qıçları ağrıyıb sızıldayırdı.* C.Məmmədquluzadə. [Firuzun] *sümükləri sızıldayır*. Ə.Məmmədxanlı.

2. *məc.* Halından, həyatından şikayətlənmək, ağlayıb-sızlamaq. *Ey sevdiyim, səndən cüda düşəli; Qan-yaş töküb sızıldaram, yanaram.* Q.Zakir. [Mirzə Bağır Mirzə Həsənə:] *Sızıldamaq elə sənin köhnə peşəndir*. Çəmənzəminli. // Zarımaq, inildəmək, ağlamaq. [Uşaq] *neçə dəfə sızıldayıb anasını çağırdı*. Mir Cəlal. [Camal] *sızıldayır, arvadı Tükəzban da başına-gözünə vura-vura şivən qoparırdı*. Ə.Abasov. *Qapı ağzında xəstə, arıq, sarıbəniz bir uşaq yerə yıxılıb sızıldayırdı*. S.Vəliyev.

**SIZILMA** "Sızılmaq"dan *f.is.*

**SIZILMAQ** b a x **sızmaq**. *Palıdlı meşənin damarlarından sızılan* (f.sif.) *sular saxsı tünklərdə boğularaq şəhərin içində nəfəs alırdı*. S.Rəhimov. [Kazım] *meşənin sərin və ətirli havasını udaraq qayanın arasından sızılan* (f.sif.) *bulağın şırıltısını öz məhzun həyatının faciəsi kimi dinləyirdi*. M.İbrahimov.

**SIZILTI** *is.* 1. Xəfif və incə ağrı; göynərti, sızı, sızıldama. *Dişin sızıltısı. Barmaqlarımın sızıltısından yata bilməmişəm. – Yazıq muzdur bir tərəfdən qolunun sızıltısı, bir tərəfdən də ürəyinin ağrısı ilə özünü evə yetirdi*. S.M.Qənizadə. [Qazan xan] *başında, bədəninin bəndlərində bir ağırlıq və sızıltı duydu.* M.Rzaquluzadə.

2. *məc.* Taleyindən, həyatından, halından şikayətlənmə; inildəmə, ağlayıb-sıtqama. // Yanıqlı, iniltili səs, çalğı. *Alıpaşa ağa bu sözləri dedikcə səsində acı bir məğlubiyyət və küdurətli bir sızıltı eşidilirdi*. Çəmənzəminli. *Muxtar radionu söndürdü. İndi sızıltı ona da xoş gəlmədi*. B.Bayramov. // Məc. mənada. *Peçdə yanan yaş odunun sızıltısı eşidildi*. M.Hüseyn.

**SIZILTILI** *sif.* Sızıltı ifadə edən; yanıqlı, təsirli, ağlar kimi səs çıxaran. *Sızıltılı səs*. – [Vaqif:] *Şairə də bu lazımdır: sızıltılı bir ney, qan saçan bir qəlb, səmalarda dolaşan bir sevgi pərisi...* Çəmənzəminli. *Yaralı .. sızıltılı səslə dedi*. Mir Cəlal.

**SIZIM** b a x **sızıntı**. *Neft sızımı. Su sızımı.*

**SIZINTI** *is.* Sızıb axan maye. *Su sızıntısı. Neft sızıntısı.*

**SIZQA** *sif.* Suyu az-az, sızılaraq axan. *Meşəli dağların ətəklərindən süzülən, sızqa bulaqlardan toplanıb üzüaşağı gələn su dərənin bir kənarını tuturdu.* S.Rəhimov. *Meşənin ortasından axan sızqa bulağın sakit şırıltısı xəzəllərin xışıltısı ilə həmahəng olmuşdu.* Ə.Vəliyev.

**SIZQOV** b a x **sızqa**. *Hər yandan tel-tel, çubuq-çubuq, budaq-budaq axıb gələn sızqovlar, çeşmələr bir-birinə qarışaraq yetmiş dəyirmanlıq su olub.* R.Rza.

**SIZLAMA** "Sızlamaq"dan *f.is.*

**SIZLAMAQ** *f.* 1. B a x **sızıldamaq**. *Muradın qəlbi* [qəbirlərin] *bu halına sızladı.* S.Hüseyn. – *Şahsuvar, Şahsuvar! – deyib ağladım; İçimdə sızladı bir yanıq kaman.* M.Müşfiq.

2. *məc.* Ağlamaq, inildəmək, yana-yana ağlamaq. [Əhməd:] *Həq sənə göndərsin Xızır İlyası; Ağlar, sızlar gördüm nazlı sənəmi.* "Aşıq Qərib". *Gilə isə bir müddət ağladı, sızladı, sonra kişini danlamağa başladı.* Ə.Vəliyev.

**SIZMA** "Sızmaq"dan *f.is.*

**SIZMAQ** *f.* Bir şeyin arasından, məsamələrindən yavaş-yavaş, damcı-damcı sızıb çıxmaq, keçmək, dammaq (mayelər haqqında). *Qayığa su sızır. Divarlardan su sızır. – Bu dərə başdan-başa su qaynağı idi. Hər ağacın, hər daşın dibindən su sızırdı.* A.Şaiq. *Qayalardan göz yaşı kimi şəffaf sular sızırdı.* İ.Əfəndiyev.

**Sİ** *is.* Musiqi qamması notlarının yeddincisi.

**SİAM** *is.* Tai tayfalarına verilən ad.

**SİAN** *is.* Kəskin iyli, rəngsiz qaz (kimya).

**SİANİD** *is.* Acı badam iyli rəngsiz uçucu maye.

**SİBO** *is.* Çində yaşayan xalq.

**SİCİLLƏMƏ** *sif.* Uzun-uzadı, çox müfəssəl, çox ətraflı surətdə (adətən "bir" sözü ilə). *Bir sicilləmə söz dedi.* – [Rəşid:] *Qapının arasından boğazını uzadıb mənə bir sicilləmə öyüd-nəsihət verdi.* İ.Hüseynov.

**SİCİM** *is.* Yundan, keçi qılından əyrilmiş ip. [Əsgər bəy:] *Xurcundan sicimi çıxart, bura ver!* M.F.Axundzadə. *..Abbas dəhrəsini və sicimini götürüb .. meşəyə üz qoydu.* S.S.Axundov.

**SİCİMLƏMƏ** "Sicimləmək"dən *f.is.*

**SİCİMLƏMƏK** *f.* Sicimlə bağlamaq. *Yükü sicimləmək.*

**SİÇAN** *is.* Təsərrüfata ziyan vuran balaca, uzunsifət, uzunquyruq, adətən boz rəngli gəmirici.

**SİÇANABƏNZƏR, SİÇANAOXŞAR** *sif.* Görünüşcə siçana oxşayan. *Siçanaoxşar gəmiricilər.*

**SİÇANQUYRUĞU** *is. bot.* Nazik köklü, dəstə şəkilli budaqları olan bitki.

**SİÇAN-PİŞİK** *is.* Uşaq oyunlarından birinin adı.

◊ **Siçan-pişik (oyunu) oynamaq** – aldatmaq, bir-birinə kələk gəlmək. *Fəqət dərd burasındadır ki, quldurlar bizimlə siçan-pişik oynayırlar.* H.Nəzərli.

**SİÇOVUL** *is. zool.* Siçanaoxşarlar fəsiləsindən, siçandan iri, uzun, xallı quyruğu olan boz rəngli gəmirici. [Adamlar Laləşova dedilər:] *Tüklü bir siçovul kimi* [kooperativdə] *şəkər taylarını gəmirmisən!* S.Rəhimov. [Saran:] *İnsanlardan qorxum yoxdur. Mən qızılları siçovullardan gizlədirəm...* M.Hüseyn.

**SİDİK** *is.* Böyrəklərin, maddələr mübadiləsi məhsulu kimi ifraz etdiyi və orqanizmdən sidik tənasül üzvləri vasitəsilə çıxan su, maye.

**SİDİKLİK** *is. anat.* Orqanizmin sidik saxlayan üzvü; sidik kisəsi.

**SİDQ** *is.* [*ər.*] Sədaqət, səmimilik, ürək təmizliyi. ☐ **Sidqlə, sidq ilə** – b a x **sidqi-ürəkdən**. *Bitibdir dağda lalə; Oxşar gül üzdə xalə; Sidqinən sevən ürək; Axır çatar vüsalə.* (Bayatı). *Artıran söz qədrini sidq ilə qədrin artırar; Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.* Füzuli. **Sidqi-ürəkdən (ürəklə), sidqi-dildən (dillə)** – səmimiyyətlə. *Sidqi-ürəkdən təşəkkür etmək. Sidqi-dildən qulluq etmək... – Mən qonaqların qabağına çıxıb, sidqi-ürəkdən onları pişvaz edirdim və onlara – xoş gəldin – deyirdim.* C.Məmmədquluzadə. [Kətxuda:] *Hərgah doğrudan Əmi sidqi-ürəklə camaatın tərəfini saxlayır isə, əlbəttə, bir iş meydana gələcəkdir.* N.Nərimanov. [Mirzə Cəmil:] *Nə qədər canım sağdır, nəfəsim gedib-gəlir, ağama sidqi-dillə qulluq eləyəcəyəm.* Ə.Vəliyev.

**SİDR** *is.* [*ər.*] *bot.* Ucaboylu, iynəyarpaqlı, həmişəyaşıl ağac. *Şam ağacından fərqli*

*olaraq sidr ağacının iynələri dəstələrlə yerləşir və bozumtul rəngli olur.* H.Qədirov.

**SİFARİŞ** *is.* 1. Bir şeyi hazırlamağı, yerinə yetirməyi və ya gətirməyi tapşırma, ismarlama. *Sifarişlər qəbulu. – Hər iki qonağın başı üstündə iki nəfər qız durub sifarişləri qəbul edirdi.* M.S.Ordubadi. // Hazırlanması tapşırılan şey, sifariş edilmiş şey. *Sifarişi qurtarmaq. Sifarişlərin verilməsi. Sifarişləri vaxtında yerinə yetirmək. – Kosa öz qohumu evində gecələmiş, Əsgərin sifarişini tədarük etmiş, indi də ağ bağlamada aparırdı.* S.Rəhimov. ☐ **Sifariş eləmək (etmək)** – bir şey hazırlamağı, ya gətirməyi tapşırmaq, ismarlamaq. *Bir yana sifariş eləyəndə bir nişanə göndərmək qədim adətlərin biridir.* C.Məmmədquluzadə. *Kərbəlayı Xəlil bacısına dedi ki, bu gün yağ, yumurta və süd göndərər, əti də qəssaba sifariş edər.* T.Ş.Simurq. [Mürsəl kişi Yunusa:] *Atana üç dəfə kağız göndərmişəm, sifariş eləmişəm ki, tez səni göndərsin, imtahanlar qurtarıb, bu gün-sabah dərslər başlanacaq.* Ə.Məmmədxanlı.

2. Tapşırıq. *..Qayadibi camaatı Səfərdən dəhşətli bir sifariş aldı.* S.S.Axundov. *Bu iki ailənin qudalığı bir-birilə baş tutarsa, qız evi sifariş göndərir ki, filan gündə nişan gətirsinlər.* R.Əfəndiyev.

**SİFARİŞÇİ** *is.* Sifariş verən, iş tapşıran.

**SİFERBLAT** [*alm.* Zifferblatt] Əqrəbli ölçü cihazları üzərində ölçülən kəmiyyəti hesablamaq üçün cədvəl, rəqəm, işarə olan lövhəcik. // Saatlarda: üzərində rəqəmlər olan lövhəcik.

**SİFƏT[1]** *is.* [*ər.*] 1. Üz. *..Hər kəs* [Xudayar bəyin] *sifətinə diqqətlə baxsaydı, əlüstü duyardı ki, Xudayar bəy bu dəqiqə fikir dəryasına, bəlkə qəm dəryasına qərqdir.* C.Məmmədquluzadə. [Gülçöhrə:] *Asya demişkən arşınmalçının sifəti yaxşı idi.* Ü.Hacıbəyov.

2. Bir şəxsi və ya şeyi başqalarından fərqləndirən hal, surət, keyfiyyət. *Mərdlik insana yaraşan ən gözəl sifətlərdən biridir.*

◊ **Sifət göstərmək** – b a x **üz göstərmək** ("**üz**"də). **Sifəti tutulmaq** – qanı qaralmaq, üzü tutulmaq. *Nazxanımın sifəti tutuldu.* İ.Əfəndiyev. **Sifətin tökülsün!** – qarğış ifadəsi. **Sifətini turşutmaq** – b a x **sir-sifətini turşutmaq**. *Kosa* [Meşinovun] *döşündən itələyərək bürüşmüş sifətini turşutdu.* S.Rəhimov.

**SİFƏT[2]** *is.* [*ər.*] *qram.* Əşyanın əlamət və ya keyfiyyətini bildirən nitq hissəsi. *Sadə sifət. Mürəkkəb sifət. Sifətin müqayisə dərəcəsi.*

**SİFƏTCƏ** *sif.* Sifətinə görə, üzdən, sifətdən, sifət cəhətdən. [Musa] *vücudca sağlam, boyca uca və sifətcə yapışıqlı idi.* Ə.Vəliyev. *Ağayar ucaboylu, sifətcə çox yapışıqlı, yaşı təzəcə qırxı ötmüş qarınlı bir kişi idi.* Ə.Əbülhəsən.

**SİFÓN** [*yun.*] 1. Mayeni yuxarı səviyyədə duran qabdan aşağı səviyyədə duran qaba axıtmaq üçün əyri boru.

2. Qazlı və ya mədən suları üçün bu cür borusu olan qab.

**SİFONLU** *sif. tex.* Sifonu olan, sifon qoyulmuş.

**SİFRAQ** *is.* [*ər.* səfra] Öddəki yaşılımtraq-sarı maddə; qusma, öyümə. *Günvurmasının əlamətləri: bərk başağrısı, başgicəllənməsi, göz qaralması, dərinin qızarması, ürək bulanması, sifraqdır.* Ə.Babayev. ☐ **Sifraq etmək** – qusmaq, öyümək, ürəyi bulanmaq.

**SİFTƏ** 1. *sif.* və *zərf* Qabaqca, əvvəlcə, əvvəl, ilk dəfə olaraq. *Siftə Bayramdan başlamalıyam.* Ə.Vəliyev. [Mərcan nənə:] *Qız xeylağı elə siftə istəmir, sonra olur yağnan bal kimi.* B.Bayramov. // *İs. mənasında.* İlk nəticə verən bir işin başlanğıcı. *Siftəsi yaxşı gəlmək. – Sözüm bəyənilib, işim saz olub; Sən allah, siftəmi kor eyləməynən.* Aşıq Ələsgər.

2. *is.* Bir şeyi satıb və ya satın alıb alış-verişə başlama. *Siftə eləmək. Hələ siftə eləməmişəm. Siftəsi uğurlu oldu.*

**SİĞƏ** *is.* [*ər.*] Köhnə məişətdə: müvəqqəti nikah, evlənmə (çoxarvadlılığın bir növü). *Qazı nikah siğəsini oxudu.* M.S.Ordubadi. ☐ **Siğə etmək (eləmək)** – köhnə məişətdə: mollaya kəbin kəsdirərək müvəqqəti evlənmək. [Qadın:] *Ağa, qulluq deyil, şəriəti-peyğəmbərdir. Məni özünə siğə etməni xahiş edirəm.* Çəmənzəminli. *Seyid Səmədə təklik əl verməyib, on altı-on yeddi yaşında bir qız siğə eləyib ocağın qırağında əyləşdi.* Ə.Haqverdiyev. // **Siğə qardaş, siğə bacı** – köhnə məişətdə: əslində qardaş və ya bacı olmayıb müəyyən dini mərasimlə əhd-peyman bağlama nəticəsində qardaş, ya bacı olmuş oğlan, ya qız. *Qərvənddə Zaman xan oğlu Qaray-*

*nan Aşıq Ələsgər siğə qardaşıydılar.* "Aşıq Ələsgər". *Deyilməyə görə, Usta Ağabala Ələsgər Ağa ilə siğə qardaş imiş və ağa ustanın xatirini belə istəyirmiş ki, onu özü ilə cənnətə aparmağı da vəd etmiş imiş.* Çəmənzəminli. ☐ **Siğə oxutdurmaq** – siğələşmə ayini icra etmək. [Dursun:] *Sabah şəhərə get, bir axunda bacı-qardaşlıq siğəsi oxutdur..* C.Cabbarlı.

**SİKKƏ** *is.* [*ər.*] 1. Metal pul üzərinə vurulan damğa, naxış, yazı. *Sikkə vurmaq. – Dəmirçioğlu bu dəfə pulları iki baş barmağının arasında sürtüb sikkələrini pozdu.* "Koroğlu".

2. Kəsilmiş, zərb olunmuş pul. *Sikkə kəsmək. – Kasıb deyiliz, sikkeyi-pulu tanırız biz.* M.Ə.Sabir. *Tahirin əlinə İran sikkəsi düşəndə, dağıtmadan cibində saxlayırdı.* S.Rəhimov. [Təbriz inqilabçıları] *..Azərbaycanı bir müstəqil ölkə kimi idarə etmək istəyirlər. Bu gün-sabah yəqin onlar adlarına sikkə də kəsdirəcəklər.* P.Makulu.

**SİKKƏXANA** *is.* [*ər.* sikkə və *fars.* ...xanə] Pul kəsilən yer, müəssisə.

**SİKKƏLİ** *sif.* Sikkəsi olan, sikkə vurulmuş. [Hacı Kərim zərgər:] *Şeyx Salah öz gözü ilə görübdür ki, Əylis erməniləri iyirmi beş min manat sikkəli pul gətirib, Molla İbrahim Xəlildən əlli pud xalis gümüş alıb aparıblar.* M.F.Axundzadə.

**SİKKƏSİZ** *sif.* Sikkəsi olmayan. [Şeyx Salah:] *..Mən gözümlə gördüm ki, Molla İbrahim Xəlilə hər kəs sikkəli pul gətirdisə, iki çəkisi sikkəsiz xalis gümüş aldı, apardı.* M.F.Axundzadə.

**SİKL** *is.* [*yun.*] Dövr, dövrə, silsilə.

**SİKLÓN** [*yun.* kyklon – fırlanan] 1. Sıx buludlu və yağmurlu havada atmosferin qasırğalı, burağanlı hərəkəti.

2. Qasırğa, boran.

**SİQÁR** [*fr.* cigare] Çəkmək üçün lülə şəkildə sıx bükülmüş tütün yarpaqları. *Siqar çəkmək. Siqar fabriki. – Çarşabın içindən gəlin əvəzinə Sərvər çıxıb, əlindəki siqarı tapança kimi uzadır Məşədi İbada tərəf.* Ü.Hacıbəyov. *Mayor masa üstündən iki siqar aldı, birini Kurta verib, birini özü yandırdı.* Ə.Əbülhəsən. *General da şəst ilə damağında siqarı; Dayanmış qərargahın o hündür eyvanında.* B.Vahabzadə.

**SİQARABƏNZƏR** *sif.* Siqara oxşayan, siqar şəklində olan.

**SİQARÉT** [*fr.*] 1. Kiçik, nazik siqar. [Fərrux] *..siqareti ağ sümük müştüyə keçirib yandırdı və tüstülətməyə başladı.* B.Bayramov.

2. Müştüksüz papiros. *Külqabı siqaret kötükləri ilə dolmuşdu.* İ.Hüseynov.

**SİQLƏT** *is.* [*ər.*] Ağırlıq. *Havanı görmək olmur, amma onun varlığına şəkk yoxdur, hətta onun siqlətini, yəni vəznini belə bilmək mümkündür.* H.Zərdabi. *Qız tutulub, heç bilməyir nə eləsin, nə? Sanki əzmiş siqlətilə güclü dağ onu.* N.Xəzri. // Məc. mənada. *Gəlin qurşunlardan tökək şeri biz; Hər sözün siqləti dönsün bir tona.* S.Vurğun. *Kim deyər ki, bu dərdin siqlətinə qədərdir?* R.Rza.

**SİQNÁL** [*alm.* Signal] 1. Hər hansı bir məlumatı, xəbəri, komandanı və s.-ni uzaqlara vermək üçün şərti səs və ya işıq işarəsi. *İşıq siqnalı. Siqnal vermək. Hava siqnalı.* – [Tahir] *uzaqdan siqnal verdi.* M.Hüseyn. *Hava təhlükəsi siqnalı arasıkəsilmədən eşidilirdi.* Ə.Vəliyev. *Mehriban bütün gücünü toplayıb siqnallara cavab verməyə çalışır, lakin bacarmırdı.* H.Seyidbəyli. // *məc.* İşarə. *Fikrimiz və yolumuz sinifsiz gələcəyə siqnaldır.* S.Vurğun.

2. *məc.* Arzuedilməz bir işin baş verdiyi və ya baş verə biləcəyi haqqında xəbərdarlıq, məlumat. [Əlyarov Ərknaza:] *..Sənin barəndə siqnal var, Riqadan hökumət mağazasının qiymətli şeylərini götürüb qaçmısan.* M.Hüseyn.

**SİQNALÇI** *is.* Siqnal verən (adam).

**SİQNALİZÁSİYA** [*rus.,* əsli *alm.* – Signaldan] 1. *tex.* Bir yerdə tətbiq edilən siqnallar sistemi. *Dəmiryolu siqnalizasiyası. Dəniz siqnalizasiyası.*

2. *tex.* Siqnal vermək üçün xüsusi qurğu, cihaz. *Siqnalizasiya xarab olmuşdu. Siqnalizasiya yaxşı işləmir.*

**SİLAH** *is.* [*ər.*] 1. Hücum və ya müdafiə üçün alət; yaraq. *..Silahlarını yanlarına atıb oturmuş üç əsgər .. söhbət edirdi.* Ə.Əbülhəsən. *Əlinə silah alanlar .. düşmən üstünə yüyürdü.* Mir Cəlal. *İsi dayı silahı çarpayıya söykədi.* B.Bayramov.

2. *məc.* Bir şeyi əldə etmək üçün vasitə, üsul, yol. *Qələm silahımız, səngər sıramız;*

*Yarasa düşməni basmış qaramız.* M.Müşfiq. [Ovçu anasına:] *İndi bu kitablardır mənim silahım, indi işıqsaçan bu silahla mən əbədi olaraq qaranlığa qarşı vuruşacağam.* Ə.Məmmədxanlı. □ **Silah oynatmaq** – müharibə ilə hədələmək, qorxutmaq. **Silaha sarılmaq** – silahlanmaq, silaha əl atmaq. [Qoca:] *Pars sarayında əsas təşkil edən yeddi əsil ailə nümayəndələri muğlara boyun əyməyərək silaha sarılıb Smerdisi devirdilər*. Çəmənzəminli. *Həqiqət qılıncla durur üz-üzə; Silaha sarılaq, ummayaq artıq; İlandan dostluq, qurddan aşnalıq.* S.Vurğun. **Soyuq silah** – kəsici, ya batıcı silah (xəncər, qılınc, süngü və s.).

**SİLAHDAR** [*ər.* silah və *fars.* ...dar] b a x **silahdaşıyan**.

**SİLAHDAŞ** *is.* Döyüş yoldaşı, mübarizə yoldaşı, birlikdə vuruşan adamlardan hər biri. *Sərkərdənin silahdaşları.* // Hər hansı fəaliyyət sahəsində yoldaş, tərəfdar, arxadaş. [Məhbubə:] *Təzə silahdaşımıza eşq olsun! – deyə, ucadan səsləndi*. H.Seyidbəyli.

**SİLAHDAŞIYAN** *is.* Orta əsrlərdə: rıtsarın silahlarına baxan, onları yanınca gəzdirən gənc əsgər. [Ovçular] *yan-yana durduqda, Don Kixot ilə onun silahdaşıyanı Sanço kimi qəribə və gülünc görünürdülər*. M.Rzaquluzadə.

**SİLAHXANA** *is.* [*ər.* silah və *fars.*] Silah, hərbi sursat anbarı.

**SİLAHQAYIRAN** *sif.* və *is.* Cürbəcür silahlar qayıran usta, sənətkar.

**SİLAHLANDIRILMA** "Silahlandırılmaq"-dan *f.is.*

**SİLAHLANDIRILMAQ** *məch.* Silahla təchiz edilmək, yaraqlandırılmaq, əlinə silah verilmək.

**SİLAHLANDIRMA** "Silahlandırmaq"dan *f.is.*

**SİLAHLANDIRMAQ** *f.* 1. Silahla təchiz etmək, əlinə silah vermək.

2. Hər hansı bir iş üçün lazımi vasitələrlə təmin etmək. *Sənaye sahələrini müasir texnika ilə silahlandırmaq*. // *məc.* Məlumat, bilik vermək, nəzəri cəhətdən hazırlamaq.

**SİLAHLANMA** "Silahlanmaq"dan *f.is.*

**SİLAHLANMAQ** *f.* 1. Özünü silahla təmin etmək, özü üçün silah tədarük etmək, silahlı hala gəlmək; yaraqlanmaq. [Kəndli Sultan ağaya:] *..Əgər bizə mərhəmət eyləsən və izin versən, bu saat atlara minib, silahlanıb karvanın qabağını kəsərik.* C.Məmmədquluzadə. *Onun mübarizə apardığı düşmən, təpəsindən dırnağına qədər silahlanmışdır*. M.S.Ordubadi. *Geyib əsgər paltarını, silahlandı qəhrəman*. S.Vurğun.

2. Hər hansı bir iş üçün lazımi vasitələr, materiallar və s. ilə özünü təmin etmək. *Neft sənayesi qabaqcıl texnika ilə silahlanmışdır.* // *məc*. Hər hansı bir iş üçün lazım olan bilikləri, məlumatı və s. əldə etmək. *Qabaqcıl nəzəriyyə ilə silahlanmaq*.

**SİLAHLI** *sif.* Silahı olan, silah daşıyan, əlində, üstündə silah olan, silaha sarılmış. *Silahlı dəstə. – Ucqar stansiyalarda .. şuluqluq salan silahlı hərbçilərə rast gəlmək olur.* Ə.Əbülhəsən. // Hərbi əməliyyat, hərbi toqquşma, əldə silah ilə aparılan, icra edilən. *Silahlı hücum. Silahlı üsyan. Silahlı mübarizə.*

**SİLAHSIZ** *sif.* və *zərf* 1. Silahı olmayan. *..Düşmən qabağına silahsız çıxmaq olmaz*. C.Məmmədquluzadə. *İndi Məhərrəm bu silahsız ordunun baş komandanı sayılırdı*. H.Nəzərli. *Silahsız çıxan yoxdur küçələrə; Gecə tövşüyüb gedir; Gecə gedir səhərə.* R.Rza.

2. Silahla olmayan. *Silahsız mübarizə aparmaq*.

**SİLAHSIZLANMA** "Silahsızlanmaq"dan *f.is.*

**SİLAHSIZLANMAQ** *f.* 1. Silahını, ya silahlarını tökmək, silahsız olmaq. // Öz silahlarını məhv etmək, ya azaltmaq. // Yerləşdirilmiş silahları götürmək, silahlardan məhrum olmaq (hərbi istehkamlar, gəmilər və s. haqqında).

2. *məc.* Mübarizədən əl çəkmək, tabe olmaq, təslim olmaq.

**SİLAHSIZLAŞDIRILMA** "Silahsızlaşdırılmaq"dan *f.is.*

**SİLAHSIZLAŞDIRILMAQ** *məch.* Silahsız hala gətirilmək, silahları əlindən alınmaq.

**SİLAHSIZLAŞDIRMA** "Silahsızlaşdırmaq"dan *f.is.*

**SİLAHSIZLAŞDIRMAQ** *f.* Silahını əlindən almaq, silahsız etmək.

**SİLƏ** *is.* [*ər.*] 1. Qovuşma, əlaqə.

2. Bağ, rabitə.

3. Hədiyyə, mükafat. [Seyid Əzim Şirvaninin Sabirə yazdığı məktubdan] "*Nuri-didəm Sabir! Qəzəlimin birinə yazdığın məlih və şirin cavab çox xoşuma gəldi. Hazırda başqa bir şeyə gümanım olmadığından həmin kitabı sənə silə göndərirəm...*" A.Səhhət.

**SİLƏLƏMƏ** "Siləiləmək"dən *f.is.*

**SİLƏLƏMƏK** *f.* Ağzına qədər doldurmaq. *Qabı siləiləmək.*

**SİLƏCƏK** bax **silgi**.

**SİLFON** *is.* [*ing.*] Paslanmayan polad, bürünc, fosforlu və ya beriliumlu tuncdan hazırlanmış nazik divarlı köndələn büzməli borucuq.

**SİLGİ** *is.* Silmək üçün yarar əsgi və s.; siləcək. *Çəkməsini silgi ilə silmək. Yazı taxtasının yanına silgi qoymaq.*

**SİLİB-SÜPÜRMƏ** "Silib-süpürmək"dən *f.is.*

**SİLİB-SÜPÜRMƏK** *f.* 1. Süpürgə, əsgi və s. ilə bir yeri silmək, süpürmək, təmizləmək. *Dükançıların bir çoxu öz dükanlarının qabağını silib-süpürürdü.* P.Makulu. [Bəyim xala] *gündə iki-üç yol həyətimizi silib-süpürür.* İ.Hüseynov.

2. *məc.* Özü ilə yığıb aparmaq, götürüb aparmaq, heç bir şey qoymamaq. [Xəlil:] *Zalım qızı otaqları elə silib-süpürüb aparıbdır ki, kağız-kuğuzdan savayı bir şey qalmayıbdır.* N.Vəzirov. [Yusif:] *Əşi, birdən elə sel gəlir ki, az qalır Sultanbud meşəsini silib-süpürüb apara.* B.Bayramov.

**SİLİKÁT** [*lat.* silex (silicis) – çaxmaqdaşı] *miner.* 1. Tərkibində silisium oksidi birləşmələri olan mineralların adı.

2. Bu mineraldan qayrılmış məmulatın (şüşə, çini, sement, kərpic və s.) ümumi adı. *Şofer gündüz saat ikidə sement anbarından beş ton sement və silikat tozu alıb şərqə tərəf yola düşdü.* M.Süleymanov.

**SİLÍNDR** [*yun.* kylindros – diyirlədirəm] 1. *riyaz.* Qapalı silindrik səth və onu qət edən iki paralel müstəvidən düzələn həndəsi cisim.

2. *tex.* Bu cisim şəklində qurğu və ya maşın hissəsi. *Mühərrikin silindri. Porşenin silindri.*

3. Təpəsi hündür, kənarları (dövrəsi) bərk şlyapa. *Şoster, başına dövrəsi geniş qara atlaz silindr qoymuşdu.* P.Makulu.

**SİLİNDRÍK** *sif.* [*yun.*] Silindr kimi, silindrə oxşayan, silindr şəkilli. *Silindrik forma. Silindrik boru. – Hazırda ayrı-ayrı yataqlardan neft çıxarmaq üçün yer üzərindən müxtəlif mexaniki vasitələrlə silindrik neft quyuları qazıyırlar.* M.Məmmədli.

**SİLİNDRLİ** *sif.* Başına silindr (3-cü mənada) qoymuş, başında silindr olan. *Bu küçənin .. başı sarıqlı axundları ilə başı silindrli ziyalıları .. bir müqəddərat daşıyırdılar.* S.Hüseyn.

**SİLİNDRŞƏKİLLİ** bax **silindrik**.

**SİLİNMƏ** "Silinmək"dən *f.is.*

**SİLİNMƏK** *məch.* 1. Yuyularaq, sürtülərək və ya silinərək təmizlənmək. *Stollar, pəncərələr silinmişdir. – Kitab şkafının şüşələri tərtəmiz silinmişdi.* Mir Cəlal.

2. Pozulmaq, görünməz olmaq, silinib getmək, silinib yox olmaq. *Divarın naxışları silinib. Abidənin yazıları silinmişdir. – Bunlardan aşağı bir pəhləvan çəkilib, boğuşan şirlərə tamaşa edirdi. Yağmurdan şirlərin birinin quyruğu silinib yox olmuşdu.* Çəmənzəminli.

3. *qayıd.* Öz bədənini, əlini-üzünü və s.-ni silmək; qurulanmaq. *Xidmətçi əlində aftafa-ləyən içəri girdi. Mərsiyəxan əllərini yuyub silindi.* Çəmənzəminli. *Bədən yaş dəsmalla yuxarıdan aşağıya doğru silinməlidir.* "Səhər gimnastikası".

4. *məc.* Unudulmaq, yaddan çıxarılmaq; yox olmaq, silinib getmək, izi qalmamaq. [İskəndər:] *Ad-sanım dünyada bilinsin gərək! Fatehlər tarixdən silinsin gərək!* A.Şaiq. *Eşqin ürək yaxan hicranı da var; Fəqət casus kimi gəzən qanunlar; Tarixdən silinib getdiyi zaman; Azad bir eşq ilə güləcək insan.* S.Vurğun. *Yenə də Lətifə Tahirin təsəvvüründən silinib getmirdi.* M.Hüseyn.

5. *məc.* Çəkilmək, görünməz olmaq, yox olmaq. *Hər iki qızı daha da məlahətli göstərən xəfif təbəssümlər heç birinin üzündən silinmirdi.* M.Hüseyn. *Rəhimlinin qıyıq gözlərindən silinməyən* (f.sif.) *təbəssüm qızartısı çəkilməyən, yumru, ətli, tüksüz sifətinə yaraşıq verirdi.* İ.Hüseynov.

**SİLİNMƏZ** *sif.* 1. Silinə bilməyən, getməyən. *Silinməz ləkə.*

2. *məc.* Yaddan çıxmaz, unudulmaz, xatirdə qalan. *Silinməz iz. Silinməz xatirələr.*

– [Bu hadisə] .. *qəlbimdə elə silinməz nəqş bağlamışdır ki, sanki .. dünən vaqe olmuşdur.* S.S.Axundov. [Qəhrəman:] *O gözlərdə, o dodaqlarda silinməz, ümidli və səmimi bir təbəssüm dururdu.* H.Nəzərli.

**SİLİ́SİUM** [*lat.* silicium – çaxmaqdaşı] *kim.* Süxurların çoxunun tərkibində olan kimyəvi element.

**SİLİST** [*rus.* "следствие" sözündən] *dan.* İstintaq, dindirmə, sorğu-sual. [Hacı Qara:] *Onların qılınc-tüfəngi o qədər məni qorxutmur ki, silisti, apar-gətiri canıma vəlvələ salır.* M.F.Axundzadə. *Tahirzadə cibindəki son manatı Məşədi İsmayıla verib silistdən qurtarmış kimi sevincək və cəld məscid həyətindən çıxdı.* Mir Cəlal. ☐ **Silist etmək** – dindirmək, istintaq etmək, sorğu-sual etmək, sorğu-suala çəkmək. ..*Təəccüb budur ki, hamı silist edənə deyib ki, ..bəy tək olub, onun yoldaşı olmayıb.* N.Vəzirov. [Hacı Murad:] *İndi durub mənnən silist edəcəkdir.* S.S.Axundov.

**SİLİSTÇİ** *is.* [*rus.* "следователь" sözündən] *dan.* İstintaq aparan vəzifəli şəxs; müstəntiq. *1920-ci ilin noyabr ayında qəza milis idarəsindən Naxçıvan xalq silistçisinə .. bir təliqə gəlmişdi.* E.Sultanov. *Çayxananın pilləkənini çıxan Meşinov dönüb Əlyara dedi: – Sən öl, yoldaş silistçi, telefonçu gülünü vurdu.* S.Rəhimov.

**SİLK** *is.* [*ər.*] 1. Feodalizm dövründəki sinfi münasibətlər əsasında meydana gələrək, varislik hüquq və vəzifələri qanunən möhkəmlənmiş ictimai qrup, təbəqə. *İmtiyazlı silklər.*

2. Ümumiyyətlə, ictimai qrup, təbəqə, zümrə. *Çünki Kərbəlayı Səlim bir mömin .. adam idi. İstədi ki, oğlu molla olub üləma silkinə daxil olsun.* M.F.Axundzadə. ..*Gündə min dəfə Allaha şükür və səna eləyirəm ki, ana dillərini bilməyən və iş görməyən müsəlman müəllimlərinin silkindən çıxıb alim, qabil və çalışan qlasnilərə yoldaş oldum.* "Mol. Nəsr." [Qocanın] ..*qiyafəsindən hansı silkə mənsub olduğu belə sezilmirdi.* Çəmənzəminli.

**SİLKƏLƏMƏ** "Silkələmək"dən *f.is.* "*TU*"*-da adi təyyarələrdə olduğundan daha sərbəst hərəkət etmək mümkündür. Burada kəskin silkələmə yoxdur.* M.İbrahimov.

**SİLKƏLƏMƏK** *f.* 1. Təkan verərək, dartaraq bu tərəfdən-o tərəfə bərk tərpətmək, yerindən oynatmaq, sarsıtmaq. *Gənc sərt əlilə Bayramı silkələdi.* M.Hüseyn. *Arvad* [Aydının] *üstünə atılıb bərk silkələdi.* H.Seyidbəyli. // Meyvələri salmaq üçün ağacı bərk tərpətmək, əsdirmək. *Tut ağacını silkələmək.* // Bir şeyin üstündəki tozu, zibili və s.-ni təmizləmək üçün çırpmaq, bərk əsdirmək, silkib təmizləmək. *Süfrəni silkələmək. Xalçanı silkələmək. – Pinəçi bir də Gülnaza baxıb fikrə getdi. Ayağa durub çirkli döşlüyünü silkələdi və: – Dalımca gəlin, – deyib, dükanın arxasına keçdi.* M.İbrahimov. [Bəy] *çubuğun külünü silkələyərək dik-dik rəncbərin üzünə baxırdı.* Mir Cəlal.

2. Atıb-tutmaq, yırğalamaq. *Araba bizi yaman silkələdi. – Bir dəfə maşın nəyin isə üzərindən tullanaraq bizi bərk silkələdikdə dodaqlarım* [leytenantın] *kürəyinə toxundu.* İ.Əfəndiyev.

3. Oynatmaq, o tərəf-bu tərəfə əsdirmək, tərpətmək. *Seyid Səməd başını bir silkələdi: – Bilirsənmi, dadaş! Burada başqa bir sirr yoxdur.* Ə.Haqverdiyev. *Boz at qəşəng başını silkələyib səkdi.* Ə.Əbülhəsən.

**SİLKƏLƏNMƏ** "Silkələnmək"dən *f.is.*

**SİLKƏLƏNMƏK** 1. "Silkələnmək"dən *məch.*

2. *qayıd.* Atılıb-düşmək, yırğalanmaq, o tərəf-bu tərəfə tərpənmək. *Maşının üstündə bir qız dayanmışdı, hey o yan-bu yana silkələnirdi.* M.İbrahimov. *Arabanın təkəri yolun çuxur yerinə düşdükdə araba bərk silkələndi.* Ə.Vəliyev. *Maşında adam az olduğundan .. silkələnir*(*di*). Ə.Əbülhəsən.

**SİLKƏMƏ** "Silkəmək"dən *f.is.*

**SİLKƏMƏK** *f.* Çırpmaq, silkələmək. *Kankan Qeybəli ayağa qalxıb, ətəyini silkədi, öz palçıq kərpicli evinə tərəf yönəldi.* S.Rəhimov. // Silkələyib, əsdirib yerə salmaq. *Sizin kimi, kal meyvəni ağacdan silkəyib yerə tökmürük!* A.Şaiq.

**SİLKİNMƏ** "Silkinmək"dən *f.is.*

**SİLKİNMƏK** 1. *qayıd.* Silkənərək üstündəki tozu-torpağı və s.-ni düşürmək. [Səfər kişi] *divarın dalına çəkilib silkinər, ətəklərini çırpıb tez qaçardı.* Mir Cəlal.

2. Bütün bədəninin cəld hərəkəti ilə üstündəki şeydən azad olmağa çalışmaq; çırpınmaq. *İslanmış qoyun, üşüyən at silkinər*. (Məsəl). *Sonatək silkinib gərdən çəkəndə; Bənzəyirsən quya, qaza, Müşkünaz!* Aşıq Ələsgər.

3. *məc.* Hərəkətə gəlmək, ayılmaq (adətən köməkçi feillərlə). S*ilkinib çıxmasa qadın mətbəxdən; Nə azad ana var, nə azad Vətən!* S.Vurğun. *Silkin, qoy dağılsın başının üstdən; Sənə gün verməyən qara buludlar.* S.Rüstəm.

**SİLKMƏ** "Silkmək"dən *f.is.*

**SİLKMƏK** *f.* 1. Bir şeyi, üstündəki tozu, xırda şeyləri düşürmək üçün əsdirmək, çırpmaq. *Palazı silkmək. Üst-başını silkmək.* – *Qurban .. durdu ayağa və ətəklərinin gəcini silkib başmaqlarını geydi və yavaş-yavaş üz qoydu getməyə.* C.Məmmədquluzadə. [Alo] *iki əl səpdikdən sonra çuxasının ətəyini silkərək gəlib, cütün dəstəyindən yapışdı.* S.Rəhimov.

2. Silkələmək. *Cənnət xanım.. başını silkib elə qışqırdı ki, üzündən pudra ələndi.* Mir Cəlal. *Bu zaman Natiq çiyinlərini silkib abanı minbərin üstünə saldı.* P.Makulu.

**SİLL** *is.* [*ər.*] *köhn.* Vərəm. [Ələkbər:] *Hər kim bu arvadın üzünə baxsa, sill azarına düşər.* N.Vəzirov. [Hacı Murad:] *Malı, dövləti çox, özünün də sill azarı var.* S.S.Axundov.

**SİLLABİK** *sif.* [*yun.* syllabikos] *ədəb.* Heca vəzninə əsaslanan, heca vəznində yazılmış. *Sillabik şeir.*

**SİLLƏ** *is.* Açıq əllə, əl ayası ilə üzə vurulan zərbə. *Sillə ilişdirmək.* – [Məşədi İbad:] *Rəhmətlik Pərizada günlərin bir günü bir sillə çəkdim ki, bir dişi sındı.* Ü.Hacıbəyov. *Nəzarətçi söyüş söydü və sağında dayanmış növbətçinin qırmızı yanağına əlinin tərsilə ağır bir sillə vurdu.* M.Hüseyn.

**SİLLƏLƏMƏ** "Sillələmək"dən *f.is.*

**SİLLƏLƏMƏK** *f.* Sillə vurmaq. *Gülnaz yerindən sıçrayıb durdu, mübaşir Məmmədi sillələdi.* M.İbrahimov.

**SİLLƏLƏNMƏ** "Sillələnmək"dən *f.is.*

**SİLLƏLƏNMƏK** *məch.* Sillə vurulmaq.

**SİLMƏ** "Silmək"dən *f.is.*

**SİLMƏK** *f.* 1. Dəsmal və s. ilə qurulamaq. *Əl-üzünü silmək. Bədəni silmək.* – [Tahir] *yaylıqla Alının yanaqlarını və alnını silib təmizlədi.* M.Hüseyn. *Nərgiz hər tərəfdən üstünə yağan suallara cavab verməden əvvəl qolu ilə gözünü sildi, başına yığılmış adamların üzünə baxdı.* Ə.Məmmədxanlı. // Əsgi və başqa bir şeylə silib çirkini və s.-ni təmizləmək. ..*Uşağın əlindəki taqalaq çörəklərin hərdən biri düşürdü yerə, arvad qaldırıb, tozunu silib verirdi uşağa.* C.Məmmədquluzadə. *Tüfənglərimizi silib təmizlədikdən sonra əl-üzümüzü yuyub otağa keçdik.* M.Rzaquluzadə.

2. Pozmaq, üstündən xətt çəkmək, çıxarmaq. *Siyahıdan silmək. Dəftərdən adını silmək.* – *Elə ki müəllimin adını sildilər, sədr dedi:* – *Adam verin, kandidat qoyaq*. Mir Cəlal.

3. *məc.* Unutmaq, xatirindən çıxartmaq. *O ilin yay tətilini bitirərək şəhərə qayıdıb işlərimə başlayınca Ceyranı tamamilə xatirimdən sildim.* S.Hüseyn.

**SİLOS** [*isp.* silo] Xırda-xırda doğranmış yem bitkilərini xüsusi yerlərdə (quyularda, xəndəklərdə və s.-də) qıcqırtma yolu ilə alınan şirəli heyvan yemi. *Silos basdırmaq. Silos doğramaq. Qarğıdalı silosu.* – [Gülsənəm:] [İmran] *bildir o qədər silos basdırmışdı ki, indiyə də qalıb.* M.Hüseyn. *Quru ot, yonca, çuğundur, silos inəklərin xoşladığı yemdir.* Ə.Vəliyev.

**SİLOSDOĞRAYAN** *is.* Silos hazırlamaq üçün yem bitkilərini doğrayıb xırdalayan maşın. // Sif. mənasında. *Silosdoğrayan maşın.*

**SİLOSLAMA** 1. "Siloslamaq"dan *f.is.*

2. Yem bitkilərinin qıcqırtma yolu ilə hazırlanması və saxlanması üsulu; silos hazırlama. *Siloslama yolu ilə bir sıra yabanı otları* (*qamış, dəvətikanı, biyan və s.*) *qiymətli yemə çevirmək mümkündür.*

**SİLOSLAMAQ** *f.* Silos etmək, silosa çevirmək, silos halına salmaq. *Qarğıdalını siloslamaq.*

**SİLSİLƏ** *is.* [*ər.*] 1. Keçmişdə qadınların başlarına taxdıqları bir-birinə keçirilmiş halqalar, pilələr şəklində bəzək, zəncirə. *Bir də görərdin ki, dövlətli qadın .. başına qızıl cütquqabağını bağladı. Onun üstündən cərgə gül, qızıl silsiləsini, həmailini bağladı..* H.Sarabski. // Zəncir.

2. Bir-birinə bitişərək sıra təşkil edən şey. *Dağ silsiləsi.* – *Silsilə dağlarından axan sellərin; Doğma bir oğluyam, doğma şairi.* A.Şaiq. *Silsilə dağlartək durub yan-yana;*

*Bakının bəzəyi neft buruqları*. S.Rüstəm. *Bir azdan .. silsilə ilə görünən qum təpələri .. işığa qərq oldu.* S.Rəhman. // Sıra dağlar. *Dağ silsiləsi. – Uzanan dik qayalar, silsilələr; Qara yellər ora dörd yandan əsər.* S.Vurğun. ◻ **Silsilə kimi** – sıra ilə, bir-birinin yanında, zəncir kimi. *Klavişlərin silsilə kimi düzülmüş bütün cərgəsinə klaviatura deyilir*. Ə.Bədəlbəyli.

3. Şəcərə, nəsil. *Üçüncü otağın divarlarında İranın sair silsilədən olan padşahlarının timsalı nəqş olunmuşdu*. M.F.Axundzadə. [Mehrəli bəy:] *Ədil bəy, mənim silsiləmdə .. mehtər olmuş şəxs yoxdur*. S.S.Axundov. *Nəslimizin qırılmaz silsiləsi onun qoynunda qüvvət alıb gələcəyə yol açmışdır – o, ədəbi və yaradıcı bir anadır*. Ə.Məmmədxanlı. // Zümrə, təbəqə.

4. *məc.* Bir şeyin ardıcıl sırası. *Xəlqilik böyük sənətkarın* [C.Məmmədquluzadənin] *xüsusən əsərlərinin surətlər silsiləsinə öz damğasını basmış, qabarıq və parlaq çıxmasına kömək etmişdir*. M.İbrahimov. *İndi o, fikir silsiləsinin qırıldığını görürdü.* Ə.Əbülhəsən. // Seriya. *Tənqidçinin jurnalda dərc etdirdiyi silsilə məqalələri.*

**SİLSİLƏCÜNBAN** *is.* [*ər.* silsilə və *fars.* cünban] *zar., köhn.* Bir məclisi idarə edən, bir dəstənin irəlidə gedəni; başçı. [Naşadın atası] *..məhərrəmlikdə məhəllə məscidində* "*silsiləcünban*" *olmuşdu*. Ə.Hüseyn. *Əhvalat vaqe olur məsciddə, camaat oturub sinələri açıq, .. silsiləcünban hacılara çay verir.* M.Əliyev.

**SİLSİLƏLİ** *sif.* Silsilə şəklində, silsiləyəoxşar, zəncirvari.

**SİLSİLƏVİ** *sif.* [*ər.*] Arasıkəsilmədən davam edən, fasiləsiz, arasıkəsilməz. *Silsiləvi reflekslər*.

**SİL-SÜPÜR** *is.* Bir yeri silib-süpürüb təmizləmə; yığışdırma. *Evin sil-süpürü qurtardı.* ◻ **Sil-süpür eləmək** – yığıb-yığışdırmaq, qaydaya salmaq, təmizləmək. *Həyəti sil-süpür eləmək.*

**SİLUÉT** [*fr.* silhouette] Kölgə; kölgə kimi görünən hər hansı bir şey; uzaqda, qaranlıqda, dumanda görünən şeyin çevrələri. *Onlar sakit və oğrun addımlarla asta-asta yeriyib, qabaqda siluet kimi görünən ağ evin yanından sola döndülər*. M.Hüseyn.

**SİLVİ** *is.* Silvilər fəsiləsindən quş cinsi.

**SİM**[1] *is.* 1. Simli musiqi alətlərinə çəkilən və tərpəndikdə səs verən elastiki tel (metaldan, bağırsaqdan və s.-dən). *Tara sim çəkmək. Ağ sim. Kök sim. – Səba oturdu, kamançanın simlərini düzəltməyə başladı.* M.S.Ordubadi. *Tarçı tarını kökləyir, kamançaçı simləri düzəldir, nəğmə-ney səsi göy qayalardan əks-səda verirdi*. S.Rəhimov.

2. *tex.* Məftil, tel. *Telefon simləri kəsilmişdi.* M.S.Ordubadi. *Mürsəlin göstərişilə parkın dörd tərəfinə elektrik simləri çəkilmiş və əlvan lampalar düzülmüşdü*. Ə.Sadıq.

**SİM**[2] *is.* [*fars.*] Yaranın iltihablanması nəticəsində mikrobların qana keçməsi. ◻ **Sim eləmək** – b a x **simləmək**[2]. *İndi Kərbəlayının başı sim eləyib, yatır və hərdən şişmiş gözlərini açıb arvada deyir..* Çəmənzəminli. *Yara işləyib sim eləmiş, iki ay* [sarıqlı mollanı] *ibadətdən qoymuşdu*. Mir Cəlal.

**SİMA** *is.* [*ər.*] 1. Üz, sifət, bəniz. *Gözəl sima. Solğun sima. Uşağın siması. – Aşıq oldum simasına, boyuna; Hayıf ki, kamalda dərin görmədim.* Aşıq Ələsgər. [Kərim babanın] *hərəkətindən və simasından gəncliyində çox igid və qoçaq olduğu anlaşılırdı.* A.Şaiq. ◻ **Mənəvi sima** – bir şəxsin daxili aləmi, daxili keyfiyyətlərinin məcmusu. // Surət, sifət. [Qazı Xudayar bəyə:] *Rəfiqim, mən şəxsin simasından bilirəm ki, bu nə tövr adamdı.* C.Məmmədquluzadə. *Bəli, çox fitnələr baş verər, inan; Mələk simasına girəndə iblis*. M.Rahim.

2. *məc.* Xarici görünüş, bir şeyi səciyyələndirən əlamətlərin məcmusu. *Bakının siması gündən-günə dəyişir. – Biz kəndlərimizin simasının bu cür kökündən dəyişilməsinə sevinirik.* Ə.Sadıq.

3. Sənətkarın öz əsərində yaratdığı tip.

4. Şəxsiyyət, şəxs. *Öz musiqi və sənəti ilə, özünün dilrüba səsilə minlərin şadlığına səbəb olan bu tarixi sima ömründə kədərdən başqa bir mükafat qazana bilmədi*. M.S.Ordubadi. *Cəlil Məmmədquluzadə Azərbaycan klassik yazıçıları içərisində görkəmli və böyük simalardan biridir.* M.İbrahimov.

**SİMASIZ** *sif.* Siması olmayan, şəxsiyyəti olmayan, özünə məxsus sifətləri olmayan, fərdi xasiyyətləri olmayan, şəxsiyyətsiz. *Nə zaman dünyadan silinəcəkdir; Simasız adamlar, yaltaq adamlar*. M.Rahim.

**SİMASIZLAŞDIRMA** "Simasızlaşdırmaq"-dan *f.is.*

**SİMASIZLAŞDIRMAQ** *f.* 1. Simasını, fərdi xüsusiyyətlərini, şəxsiyyətini itirməsinə səbəb olmaq. *Həyat Yarməmmədi əzib qorxuzmuş, simasızlaşdırmışdı.* M.İbrahimov.

2. *məc.* Məsuliyyətsizlik yaratmaq, iş üçün şəxsi məsuliyyət olmadığı bir şərait yaratmaq. *Rəhbərliyi simasızlaşdırmaq*.

**SİMASIZLAŞMA** "Simasızlaşmaq"dan *f.is.*

**SİMASIZLAŞMAQ** *f.* Simasını itirmək, özünə məxsus keyfiyyətlərini, xüsusiyyətlərini itirmək; şəxsiyyətsizləşmək.

**SİMASIZLIQ** *is.* 1. Siması olmama; fərdi xüsusiyyətlərdən, keyfiyyətlərdən məhrumluq; şəxsiyyətsizlik. *Simasızlıq, yüz il ömür sürsən də sən; Alqış səsi eşitməzsən bircə kərə.* S.Vurğun. *Simasızlıq* [Yarməmmədin] *qalxanı idi*. M.İbrahimov.

2. *məc.* Tapşırılan iş, mexanizm, alət və s. üçün adamların şəxsən məsuliyyət daşımamasına imkan yaradan hal, iş şəraiti. *İşdə simasızlıqla mübarizə. Simasızlığı aradan qaldırmaq*.

**SİMFONİ́K** [*yun*. symphonos – ahəngdar] *sif. mus.* 1. Simfoniya musiqi forması ilə bağlı olan. *Mövzunun simfonik işlənməsi. Simfonik muğam.*

2. Nəfəsli, zərbli, simli ansamblın ifası üçün yazılmış; bu cür ifa ilə bağlı olan. *Simfonik musiqi. Simfonik etüdlər. Simfonik konsert. – İndi bizim dünyada şöhrət qazanmış simfonik əsərlərimiz, romanslarımız, mahnılarımız vardır*. İ.Əfəndiyev.

◊ **Simfonik orkestr** – üç qrup simli, zərbli və nəfəsli musiqi alətini birləşdirən musiqi ansamblı. *Lakin bunun dalınca simfonik orkestr orta səviyyəli bir süita çalanda* [Yavər] *başını buladı*. M.İbrahimov. *1938-ci ildə Moskvada keçirilən Azərbaycan incəsənəti ongünlüyündə bu orkestr* "*Arşın mal alan*" *musiqili komediyasında simfonik orkestri əvəz etdi*. Ə.Bədəlbəyli.

**SİMFONİ́ST** [*yun.*] Simfonik əsərlər yaradan bəstəkar, simfoniya müəllifi.

**SİMFÓNİYA** [*yun.* symphonia – ahəngdar] Orkestr üçün yazılmış bir-birindən sürət və ahənginə görə fərqlənən, adətən 3-4 hissəli böyük musiqi əsəri. *Bu gün çaldığı əsər* [Səlbinin] "*Azad insan*" *simfoniyası idi*. M.Hüseyn. *Bax! Hər yandan səs gəlir; Simfoniyalar yüksəlir.* M.Dilbazi. // *məc*. Çoxlu müxtəlif səslərin, rənglərin, tonların ahəngi, ahəngdar birliyi. *Sanki simfoniyadır bu gözəl ahəng; Necə sim üstündə o qurulmuşdur*. S.Vurğun. ..[Ağbulaq meşələrinə] *toplanıb gələn saysız-hesabsız bülbüllərin ahəngdar nəğmələri bir simfoniyanı təşkil edirdi*. S.Rəhimov.

**SİMFONİ́ZM** [*yun.*] Simfoniya sənətkarlığı, simfoniya üslubu. .."*Yeddi gözəl*" *baletinin musiqisi simfonizm əzəmətinin yaratdığı vüsətə malik və emosional cəhətcə dolğun məzmunlu böyük bir ilham məhsuludur.* Ə.Bədəlbəyli.

**SİMİC** *sif.* Xəsis, bərk. *Simic adam. Simic* (z.) *olmaq*.

**SİMİCLƏŞMƏ** "Simicləşmək"dən *f.is.*

**SİMİCLƏŞMƏK** *f.* Simic olmaq, xəsis olmaq.

**SİMİCLİK** *is.* Xəsislik. [Faytonçu:] *Sənin pulunun sayı-hesabı yoxdur; belə simiclik nəyə lazımdır?* Ə.Haqverdiyev. [Rüstəm:] *Qoy dost-aşna da deməsin ki, Rüstəm kişi simiclik elədi, malına qıymadı*. M.İbrahimov.

**SİMİN** *sif.* [*fars.*] *köhn.* 1. Gümüşdən qayrılmış, düzəldilmiş.

2. Gümüşü.

**SİMLƏMƏ¹** "Simləmək¹"dən *f.is.*

**SİMLƏMƏ²** "Simləmək²"dən *f.is.*

**SİMLƏMƏK¹** *f.* Sim çəkmək (musiqi alətinə). *Tarı, kamançanı simləmək*.

**SİMLƏMƏK²** *f.* Yaranın iltihabı nəticəsində qana keçmək (mikrob). [Allahqulu:] *Güllə içəridə qalıb simləyər*. Ə.Əbülhəsən.

**SİMLİ** *sif.* Simi olan, sim salınmış. *Simli saz. Simli tar. – Tar, məlum olduğu kimi, Əsədoğlu Mirzə Sadıqadək yalnız beş simli bir musiqi aləti idi.* Ə.Bədəlbəyli. // Simlərlə çalınan, simlərlə səsləndirilən. *Simli çalğı alətləri. Simli orkestr.*

**SİMMENTAL** *is.* [*fr.*] İribuynuzlu malqara cinsi.

**SİMMETRÍK** *sif.* [*yun.*] Simmetriyası olan, simmetriya qanununa görə qurulmuş; mütənasib. *Simmetrik planlaşdırma. Şəkilləri divardan simmetrik* (z.) *asmaq. Şeylərin simmetrik düzülüşü. – Xalının üstündə simmetrik düzülmüş altı yumşaq kreslo vardı.* M.İbrahimov.

**SİMMETRİKLİK** *is.* Simmetrik şeyin halı; bir şeydə simmetriya olması; mütənasiblik.

**SİMMETRÍYA** *is.* [*yun.* symmetria] Bütöv bir şeyin hissələrinin mərkəzə, ortaya görə uyğun, mütənasib düzülüşü, yerləşməsi; düzülüşcə uyğunluq, mütənasiblik. *Həndəsi cisimlərin simmetriyası. İnsan bədəni hissələrinin simmetriyası.*

**SİMPÁTİYA** [*yun.* sympatheia – rəğbət] Bir adama və ya bir şeyə qarşı rəğbət, meyil, cazibə.

**SİMPLEKS** *is.* [*lat.*] Kombinator topologiyanın əsas anlayışlarından biri.

**SİMPÓZİUM** [*lat.* simposium, əsli *yun.* kef məclisi] Hər hansı bir xüsusi elmi məsələyə dair bəzi, o cümlədən beynəlxalq müşavirələrin adı. *Tarix məsələlərinə həsr olunmuş simpozium. Astronavtika üzrə beynəlxalq simpozium.*

**SİMPTOM** *is.* [*yun.*] Hər hansı bir şeyin, hadisənin əlamətləri.

**SİMSAR** *sif.* [*fars.*] 1. Yaxın, daha yaxın.

2. Gümüş rəngli, gümüşü.

**SİMURQ** *is.* [*fars.*] Qədim İran əsatirində guya Qaf (Elbrus) dağında yaşayan böyük bir quş. *Qaf dağıdır bura, quşlar soltanı; Ancaq simurqlar qonan qayanı; Kim çulğayır qalın qara dumanlar.* A.Səhhət. *Hər cahangir bir dəfə dırmandı Qaf dağına; Bir çoxları qurşandı simurqun sorağına.* Ə.Cavad.

**SÍMVOL** [*yun.* symbolon] Hər hansı bir anlayışın, ideyanın şərti əlamətini ifadə edən işarə; rəmz. *Göyərçin sülh simvoludur. Gənclik cəsarət simvoludur. – Gözəl Əlhəmra sarayları, həqiqət və mərdlik simvolu olan Madrid tar-mar edilirkən .. bəşəriyyət Münhen oyununun şahidi oldu.* M.İbrahimov. *Sevil Gülüşün köməyilə əsarətin simvolu olan çadranı Balaşın üzünə çırpıb evdən çıxır.* M.Arif. // *ədəb.* Hər hansı fikri, duyğunu, hissiyyatı ifadə edən bədii obraz. *Sevgi simvolu. Xalq qüdrətinin simvolu. Qəhrəmanlıq simvolu.* // *xüs.* Hər hansı bir elmdə qəbul olunmuş kəmiyyətin şərti işarəsi, rəmzi. *Kimyəvi elementlərin simvolu. Kristalloqrafiya simvolları.*

**SİMVOLÍK** *sif.* [*yun.*] Simvoldan ibarət olan, bir şeyin rəmzi olan, hər hansı bir şeyi simvollarla ifadə edən; rəmzi. *Simvolik təsvir. Simvolik rəsm.*

**SİMVÓLİKA** [*fr.* symbolon-dan] 1. Fikirləri, məfhum və ya hissləri şərti işarələr (simvollar) vasitəsilə ifadə etmə.

2. *top.* Simvollar; hər hansı simvolların məcmusu.

**SİMVOLÍST** [*yun.*] Simvolizm tərəfdarı.

**SİMVOLÍZM** [*fr.* symbolisme, əsli *yun.*] XIX əsrin axırlarında və XX əsrin əvvəllərində incəsənət və ədəbiyyatda burjua-zadəgan əhvali-ruhiyyəsini ifadə edən cərəyan (simvolizm tərəfdarları öz fikirlərini eyhamlarla, kinayə və işarələrlə ifadə edir, siyasətə qarışmamağı və "sənət sənət üçündür" şüarını təbliğ edirdilər).

**SİN** [*ər.*] Ərəb əlifbasında (س) hərfinin adı.

**SİNAQOQ** *is.* [*yun.*] 1. Yəhudi məbədi.

2. Yəhudilərin ibadət etdikləri yer.

**SİNC** [*fars.*] İki metallik (mis) diskdən ibarət olub, bir-birinə vurduqda spesifik səs çıxaran musiqi aləti. [Xortdan:] *Qədim zamanda gün çıxanda onu şeypur, təbil və sinc ilə istiqbal edirdilər.* Ə.Haqverdiyev. [Harun:] *Çalınsın təbil, sinc, qoşun rəqs etsin.* Ü.Hacıbəyov. *Sinclərin amansız cingiltisi, təbillərin müdhiş gumbultusu göyə yüksəlir.* Ə.Məmmədxanlı.

**SİNCAB** *is.* [*fars.*] *zool.* Ağaclarda yaşayan və açıq-kül rəngində qiymətli xəzi olan gəmirici kiçik heyvan. // Bu heyvanın dərisindən tikilmiş kürk.

**SİNCÇİ** *is.* Sinc çalan.

**SİNDİKALÍST** [*yun.*] Sindikalizm tərəfdarı.

**SİNDİKALÍZM** [*fr.* syndicalisme] XIX əsrin sonu – XX əsrin əvvəllərində fəhlə hərəkatında ortaya çıxmış xırda burjua cərəyanı; bu cərəyan tərəfdarları proletariatın sinfi mübarizəsini və proletar dövlətin yaradılması zəruriyyətini inkar edirdilər.

**SİNDİKÁT** [*fr.* syndicat] 1. Kapitalist ölkələrində: satış bazarlarına hakim olmaq və ifrat qazanc götürmək üçün sahibkarların inhisarçı birləşmə formalarından biri.

2. Fransada və bəzi burjua ölkələrində həmkarlar ittifaqlarının adı.

**SİNDİKATLAŞDIRMA** "Sindikatlaşdırmaq"dan *f.is.*

**SİNDİKATLAŞDIRMAQ** *f.* Sindikatlar şəklində birləşdirmək. *Mədən və metallurgiya sənayesini sindikatlaşdırmaq.*

**SİNDİRMƏK** *f. məh.* 1. Əymək.

2. Kiməsə, nəyəsə əyilməyə, tanınmağa məcbur etmək.

**SİNDRÓM** *is.* [*yun.*] Hər hansı xəstəliyin səciyyəvi əlamətləri.

**SİNEKDOXA** *is.* [*yun.*] Əks mənalı sözlər işlətməkdən ibarət olan stilistik üsul.

**SİNEL** *is.* [*fr.*] Qotaz, saçaq qayırmaq üçün məxmər qaytan.

**SİNƏ** *is.* [*fars.*] 1. Döş, köks. [Müəllim] *Tellinin nəfəs aldıqca qalxıb-enən sinəsinə baxırdı.* S.Hüseyn. *Qız başını sinəsinə endirdi.* M.Hüseyn. // Bədənin, ciyərlərin və ürəyin yerləşdiyi həmin nahiyəsi; döş qəfəsi.

2. Yamac. *Dağların sinəsindən axıb gələn bulaqlar və xırda çaylar isə birləşərək daha güclü və iri çaylara çevrilir.* M.İbrahimov. *Budur, dikbaşlı dağlar; Sinəsi daşlı dağlar; Yerli-dibli sökülür.* M.Müşfiq.

3. *məc.* Ürək, qəlb mənasında. *Sinəm yanır. Sinəsində məhəbbəti olmaq. – Aləm bilir, çoxdur sinəmdə dərdim; Doqquz ay qoynumda oğul bəslədim.* "Aşıq Qərib". *Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm; Fəda olum sənə, gəl eylə imtahan, ölürəm.* X.Natəvan.

4. **Sinəsindən** şəklində – özündən. *Bundan sonra görüm kim cürət edib dilinə gətirə biləcək ki, belə iş yoxdur, bu əhvalatı dərviş öz sinəsindən icad edib.* N.Vəzirov.

◊ **Sinə gərmək** – özünü qorxmadan qabağa verərək, mərdcəsinə qorumaq, müqavimət göstərmək; köks gərmək. *O hər cövrə, cəfaya sinə gərdi, dayandı; Yanmadı tək həyatda, öləndə də o yandı!* B.Vahabzadə. **Sinə vermək** – b a x **sinə gərmək**. **Sinə vurmaq** – məhərrəm ayında yas əlaməti olaraq əlləri ilə öz sinələrinə vurma mərasimi. [Uşaqlar] *sıra ilə oturub, avaz ilə .. mərsiyə deyər, sinə vurardılar.* H.Sarabski. [Fərəc:] *Mən danışdıqca, ərz olsun, gərək siz də ağlayasınız və sinə vurasınız.* Qantəmir. **Sinəsinə dağ çəkmək** – b a x **ürəyinə dağ çəkmək** ("**ürək**"də). [Əbdül:] [Saranın] *ölümü mənim sinəmə dağ çəkdi.* C.Cabbarlı. *Rübabə bu rəftarı ilə Gəldiyevin sinəsinə sanki bir dağ çəkdi.* Mir Cəlal. *Mən tez endim atımdan, əyildim ona sarı; Sinəmə dağ çəkirdi həzin pıçıltıları.* B.Vahabzadə. **Sinəsinə sərin su səpmək** – b a x **ürəyinə buzlu su səpmək** ("**ürək**"də). *Nisə xalanın sinəsinə sərin su səpdilər.* Mir Cəlal. **Sinəsinə yatmaq (düşmək)** – b a x **ürəyinə yatmaq** ("**ürək**"də). *Dəmirin hərəkətləri, hazırcavablığı Sevdim kişinin sinəsinə yatırdı.* Ə.Vəliyev. **Sinəsini qabağa (irəli) vermək (sipər etmək)** – b a x **sinə gərmək**. [Rüstəm Qızyetərə:] *Nə deyəcəksən, həm manqabaşçısısan, həm də fəal, sinəni ver qabağa, katibi oturt yerində.* M.İbrahimov. *Cəngavərlər sinələrini sipər edib, ağ gün uğrunda ölüm-dirim döyüşlərinə atılırlar.* S.Rəhimov.

**SİNƏBƏND** *is.* [*fars.*] 1. Zinət üçün qadınların döşlərinə taxdıqları qızıl və ya gümüş bəzək, sancaq və s.

2. Yəhəri saxlamaq üçün atın boynundan döşünə doğru çəkilən qayış. *Ağ at gəlir enişdən; Sinəbəndi gümüşdən; Bizə də qismət olsun; Heybədəki yemişdən.* (Bayatı).

**SİNƏBƏNDLİ** *sif.* Sinəbənd taxmış. *Sinəbəndli qız.*

**SİNƏDƏFTƏR** *sif.* və *is.* [*fars.* sinə və *ər.* dəftər] Yaddaşı, hafizəsi möhkəm olan; çox bilən, ürəyində çox sözü olan, hazırcavab. [Mürsəl:] *Dədə, deyirlər Turaclıda sinədəftər kişilər olub.* Ə.Vəliyev. [Aşıq Valehin] *gəncliyi gözəllərin həsrəti ilə yanmış, sinədəftəri qapanmış, səsindəki şux təranələr susmuşdu.* Ə.Məmmədxanlı. // Hafizə, yaddaş. *Çox şairlərin əşarı* [Mirzə Səfərin] *sinədəftərində səbt olunmuşdu. Şeirlər oxuyardı və oxuyandan sonra da onları əyri-üyrü rus dilinə tərcümə edərdi.* Ə.Haqverdiyev.

**SİNƏDƏN** b a x **döşdən**. *Sinədən demək, oxumaq. – O gündən camaatın içində yayıldı ki, Ələsgərə vergi verilib; sazı götürüb sinədən deyir.* "Aşıq Ələsgər".

**SİNƏDOLUSU** 1. *zərf* Dərindən, köks dolusu. [Tahirzadə] *sərbəst sinədolusu nəfəs alaraq yoluna davam etdi.* Mir Cəlal. *Aydın .. sinədolusu rahat nəfəs aldı.* H.Seyidbəyli.

2. B a x **ürəkdolusu**. *Belə gündə adamlar könüldolusu məhəbbət, sinədolusu iftixar hissi ilə bayram təntənəsinə gəlirlər.* R.Rza.

**SİNƏGİR** [*fars.*] b a x **astma**.

**SİNƏK** *is.* Milçək, çibin.

◊ **Sinək vızıltısı qədər** – əsla, qətiyyən, zərrə qədər. *Bu sözün Kərim babaya bir sinək vızıltısı qədər təsiri olmadı.* A.Şaiq.

**SİNƏKQAPAN** *is. zool.* Milçəkyeyən quş.

**SİNFİ** *sif.* Müəyyən bir sinfə, onun ideologiyasına xas olan, bu və ya başqa sinfin mənafeyindən irəli gələn, doğan. *Sinfi mübarizə. Sinfi ziddiyyətlər. Sinfi baxımdan.*

**SİNXRÓN** *sif.* [*yun.*] 1. *xüs.* Sinxronizmi ilə fərqlənən; eyni zamanda, bir vaxtda olan, baş verən. *Motorun sinxron firlanması. Kinokadrların sinxron çəkilməsi* (*eyni zamanda şəkil çəkilməklə bərabər səsin yazılması*). *Sinxron tərcümə* (*danışanın sözlərini, o danışdıqca eyni zamanda tərcümə etmə*).

2. *tex.* Sinxronizm prinsipi tətbiqinə əsaslanan. *Sinxron mühərrik. Sinxron motorlar. Sinxron kino çəkilişi.*

**SİNXRONÍK** *sif.* [*yun.*] Eyni zamanda, bir vaxtda olmasını göstərən, ifadə edən; eyni zamanda, bir vaxtda olan, davam edən, baş verən.

**SİNXRONÍYA** [*yun.*] 1. B a x **sinxronizm**.

2. *dilç.* Hər hansı tarixi bir dövrdə bu və ya başqa dil elementlərinin eyni zamanda mövcud və bir-birindən asılı olması.

**SİNXRONÍZM** [*yun.* synehronismos] *kit.* İki və ya bir neçə hadisənin və ya prosesin eynilə bir vaxtda, eyni zamanda olması.

**SİNXRONLUQ** *is.* b a x **sinxronizm**.

**SİNİ** *is.* Misdən, bürüncdən və s.-dən qayrılmış böyük, dəyirmi, dayaz qab. *Çörəyi siniyə qoymaq. Siniyə plov çəkmək. Şamları sininin ətrafina düzmək.* – [Kərbəlayı Cəfər] *..naəlac qalıb getdi, süfrəni açdı ortalığa, bir az quru çörək doğradı siniyə..* C.Məmmədquluzadə. *Hənifə qazanı içəri gətirib yerə qoydu, ətəyilə sininin üstünə tökülmüş külü sildi.* İ.Hüseynov.

**SİNİF** *is.* [*ər.*] 1. Elmi və digər təsnifatda: a) *biol.* bitki və heyvanların təsnifatında böyük bölmələrdən (şöbələrdən) biri. *Suda-quruda yaşayanlar sinfi. Məməlilər sinfi. İkiləpəli bitkilər sinfi.* – *Zooloji təsnifata görə bal və ya ev arısı buğumayaqlılar tipinin cücülər sinfindən, pərdəqanadlılar dəstəsinə daxil olan arılar fəsiləsinin bal verən arılar cinsindəndir.* R.İbrahimov; b) *mənt.* müəyyən keyfiyyətə, xüsusiyyətə malik olan eynicinsli şeylərin məcmusu.

2. Dərəcə, bölgü. // Gəmilərin, vaqonların, paroxodların və s.-nin quruluş tipindən və təchizatından asılı olaraq bölgü dərəcəsi.

3. İctimai təbəqə, zümrə. *Çexov müxtəsər və qısaca hekayələrdə rus millətinin hər bir sinfinə dair əhvalat yazıb.* F.Köçərli. *İki şey lazım olur: ya gərək sən elə bir zat olasan ki, bu söz sənə deyilsin, ya budur ki, sən haman sözü deyən sinifdən olasan.* Qantəmir. *Mən əzilən bir sinfin hayqıran; Haqq bağıran sədasından yarandım.* M.Müşfiq.

4. İbtidai və orta məktəb şagirdlərinin, oxuduqları dərs ilinə uyğun olaraq bölgüsü. *İkinci sinif şagirdi.* – *Mirzə Səfərin iki oğlu ədliyyə məktəbinin beşinci sinfində oxuyurdular.* Ə.Haqverdiyev. *Aşağı siniflərdə birinci dərslərim pis keçmədi.* A.Şaiq. // Musiqi və rəssamlıq məktəblərində müəyyən müəllimin rəhbərliyi altında məşğələ və ya müəyyən fənn keçən şagirdlər qrupu. *Royal sinfi. Heykəltəraşlıq sinfi.* // Məktəbdə dərs keçilən otaq. *Sinif qapıları açılır birdən; Çıxır həyəcanla bir-bir uşaqlar.* N.Rəfibəyli. *Bir canlanma, bir şənlik var; Geniş sinif otağında.* M.Dilbazi.

**SİNİFDAŞ** *is.* 1. Eyni ictimai sinfə mənsub olanlardan hər biri, eyni sinifdən olan adam.

2. Bir sinifdə oxuyanlardan hər biri.

**SİNİFDƏNKƏNAR, SİNİFDƏNXARİC** *sif.* Sinif, dərs məşğələləri zamanı deyil, kənar vaxtda olan. *Sinifdənxaric məşğələlər.*

**SİNİFLİ** *sif.* Siniflərə bölünmüş, sinifləri olan (b a x **sinif** 3-cü mənada). *Sinifli cəmiyyət.*

**SİNİFSİZ** *sif.* Siniflərə bölünməmiş, siniflər olmayan (b a x **sinif** 3-cü mənada). *Sinifsiz cəmiyyət.*

**SİNİR** b a x **əsəb**. [Solmaz:] *Bütün sinirlərim kaman teli kimi inləyir*. C.Cabbarlı. [Xəlil] *xırda otağında bir-iki dəfə ötəyə-bəriyə gedib, sinirlərini yatırmaq üçün yazı masasına oturdu*. Çəmənzəminli.

**SİNİRLƏNMƏ** "Sinirlənmək"dən *f.is.*

**SİNİRLƏNMƏK** b a x **əsəbiləşmək**. [Reyhan:] *Möhsün, sakit ol, axır həkim sənə deyib ki, sinirlənmək olmaz*. Çəmənzəminli. [Knyaz:] *Heç sinirlənmə, yoruldun, enəlim; Musiqi dinləyərək əylənəlim*. H.Cavid.

**SİNİRLİ** b a x **əsəbi**. [Dilbər:] *..Belə sinirli bir halda* [Balaşa] *danışa bilmərəm*. C.Cabbarlı. [Murad] *..hissiyyatına məğlub olan, zəif sinirli bir adam da deyildi*. S.Hüseyn.

**SİNK** [*alm.*] *kim.* Göyümtül-ağ rəngli döyülə bilən metal – kimyəvi element. // Sinkdən qayrılmış, sinkdən hazırlanmış. *Sink vedrə. Sink əlüzyuyan.*

**SİNKLƏMƏ** "Sinkləmək"dən *f.is.*

**SİNKLƏMƏK** *f.* Polad və çuqun məmulatı korroziyadan qorumaq üçün üzərinə sink çəkmək.

**SİNKLƏNMİŞ** *f.sif.* Sink sürtülmüş, sinklə örtülmüş, üzərinə sink çəkilmiş. *Sinklənmiş dəmir. Sinklənmiş vedrə. – Sinkdən olan və yaxud üzü sinklənmiş qablarda süd, qatıq, şorba və bu kimi turşulu və duzlu şeylər saxlamaq olmaz.* A.Quliyev.

**SİNKÓQRAF** [*alm.* Zink və *yun.* grapho] Sinkoqrafiya mütəxəssisi.

**SİNKOQRÁFİYA** [*alm.* və *yun.* graphio] 1. Mətbəə çapı üçün sink klişe hazırlama üsulu.

2. Bu cür klişelər hazırlayan müəssisə.

**SİNQÁ** [*rus.*] *tib.* Qidada vitaminlərin çatışmaması nəticəsində meydana gələn və diş ətinin boşalması, yumşalması və ondan qan axması şəklində təzahür edən xəstəlik.

**SİNQALI** *sif.* Sinqa xəstəliyi olan.

**SİNLİ** *sif.* Yaşlı, yaşa dolmuş, ahıl, qocalmış. *Sinli qadın. Sinli kişi.*

**SİNMƏ** "Sinmək"dən *f.is.*

**SİNMƏK** *f.* 1. Gözə daha az çarpmaq üçün aşağı oturmaq, əyilmək, gizlənmək, çuxura yatmaq; qorxub büzülmək. *Kərbəlayı Tapdıq bəllədiyi tağların dibinə sindi*. Mir Cəlal. *Tank Aslanın yerə sindiyi çökək üzərinə sıçradı*. Ə.Məmmədxanlı. *Bu quşlar çox vaxt tək-tək, bəzən cüt-cüt gəzər və bir təhlükə hiss etdikdə sinib gizlənər*. M.Rzaquluzadə.

2. Çökmək. *Yeni gülümsəməkdə olan baharın həyatverici munis günəşi dağların arxasında gizləndiyindən ətrafa həzin bir axşam qaranlığı sinməkdə idi*. İ.Hüseynov.

3. Tutub əyilmək. *Kərəm yəhərin qaşına sinmişdi*. M.Hüseyn. *Baxış bəy hirslə ata bir-iki şallaq vurub, onun yalına sindi*. Ə.Abasov.

4. *məc.* Cəsarəti qırılaraq səsini kəsmək, qorxmaq, çəkinmək. *Xudayar bəy bir az sinib çəkildi kənara*. C.Məmmədquluzadə.

5. Tərkiblərdə: **ürəyinə (canına və s.) sinmək** – ürəyinə yatmaq, xoşuna gəlmək, ürəyincə olmaq. [Heybət Salmana:] *Kökəlməyin də şərti var. Əgər istəyirsən yediyin canına sinsin, gərək mayana haram qatmayasan*. M.Hüseyn.

**SİNN** *is.* [*ər.*] Yaş. *Xudayar bəyin ancaq otuz yeddi-otuz səkkiz sinni olar, artıq olmaz, bəlkə, əskik ola*. C.Məmmədquluzadə. *Gülsüm xalanın sinni əlli beşə yaxınlaşırdı*. Ə.Haqverdiyev. [Ağalarov Dilaraya:] *Mənim sinnim altmışı keçmişdir, qızım!* Ə.Məmmədxanlı.

**SİNÓD** *is.* [*yun.*] Pravoslav və protestant kilsələrində yüksək rütbəli ruhanilər məclisi.

**SİNOLOGİYA** [*lat.* Sina – Çin və *yun.* loqos – anlayış, elm] b a x **çinşünaslıq**.

**SİNOLOQ** b a x **çinşünas**.

**SİNÓNİM** [*yun.* synonymos – eyniadlı] *dilç.* Mənaca başqa sözlə bir, yaxud ona çox yaxın, deyilişcə (səslənmə cəhətdən) isə müxtəlif olan söz; məs.: "ürək" və "qəlb", "qoçaq" və "cəsur" və s.

**SİNONİMÍK** *sif. dilç.* Sinonim olan, mənaca çox yaxın və ya eyni olan. *Sinonimik ifadələr.*

**SİNONÍMİKA** [*yun.*] *dilç.* 1. Bir dilə məxsus sinonimlər.

2. Leksikologiyanın sinonimlər bəhsi.

**SİNONİMÍYA** [*yun.* synonymos – eyniadlılıq] b a x **sinonimika** 1-ci mənada.

**SİNONİMLİK** *is.* Sinonim olma, mənaca çox yaxın və ya eyni olma. *Sözlərin sinonimliyi.*

**SİNÓPTİK** [*yun.*] Havanın proqnozunun necə olacağını qabaqcadan xəbər verən mütəxəssis – meteoroloq.

**SİNÓPTİKA** [*yun.* synoptikos] Hava və onun necə olacağı haqqında qabaqcadan məlumat verən elm.

**SİNOV: sinov getmək** *dan.* – bir şeyin tamarzısında, həvəsində, həsrətində olmaq. *Belə şeyləri dirigözlü divanın ovcuna qoymaqdan ötrü, baxırsan ki, Göyərçin apaşkar sinov gedir*. S.Rəhimov. [Tahir Səməndərə:] *Ancaq qızdan nahaq əl çəkdin, görmürdün, oynamaq üçün sinov gedirdi?* M.Hüseyn. [Mirzə Qərənfil:] *Təqsir səndədir. Qızlar var ki, sənin üçün sinov gedirlər. Sən onları gözüyaşlı qoyub dağa-daşa əl atırsan.* S.Rəhman.

**SİNSİMƏ** "Sinsimək"dən *f.is.*

**SİNSİMƏK** *f.* İncimək; birindən incidiyini başqasına söyləmək, şikayətlənmək, gileylənmək.

**SİNSİTMƏ** "Sinsitmək"dən *f.is.*

**SİNSİTMƏK** *f.* İncitmək, narahat etmək, iztirab vermək; xatirinə dəymək, narazı salmaq. *Ehtiyac və aclıq qorxusu xüsusən yaşlı adamları, qocaları sinsidirdi.* M.İbrahimov. *Aldığın cavabdan gileylənmə sən; Qaydadır, sinsidər sevən sevəni.* B.Vahabzadə.

**SİNTAKSİS** [*yun.* syntaxis – tərtib] *dilç.* 1. Bir dilə xas olan cümlə quruluşu və cümlədə sözlərin birləşməsi üsulu.

2. Qrammatikanın, cümlə quruluşunu və cümlədə sözlərin birləşməsi üsullarını öyrənən bölməsi.

**SİNTAKTİK** *sif.* [*yun.*] *dilç.* Sintaksisə aid olan. *Cümlənin sintaktik təhlili.*

**SİNTAQMATİKA** *is.* [*yun.*] 1. Dil tədqiqinin iki aspektdən biri.

2. Nitq vahidlərinin birləşmə qayda-qanunlarının məcmusu.

**SİNTETİK** *sif.* [*yun.*] 1. Sintez (1-ci mənada) tətbiqinə əsaslanan. *Sintetik tədqiq üsulu.*

2. *kim.* Sintez (2-ci mənada) əsasında alınmış, sintez yolu ilə alınmış materialdan hazırlanmış; süni. *Sintetik kauçuk. Sintetik lif. Sintetik yanacaq. Sintetik mallar*.

3. *dilç.* Cümlədə qrammatik əlaqələrin sözlərin formaları ilə ifadə olunması. *Dilin sintetik quruluşu.* □ **Sintetik dillər** – elə dillərə deyilir ki, analitik dillərin əksinə olaraq, bunlarda sözlər bir neçə mənalı hissələrdən (morfemlərdən) əmələ gəlir və yalnız məlum anlayışı deyil, habelə cümlədə sözlər arasındakı qrammatik əlaqələri də ifadə edir.

**SİNTEZ** [*yun.* synthesis – birləşmə] 1. Bir şeyi və ya hadisəni küll halında, onu təşkil edən hissələri arasındakı qarşılıqlı əlaqə və vəhdəti daxilində tədqiq etmə üsulu; (*analiz* ziddi). *Sintez elmi idrak prosesində analizlə bağlıdır.* // *kit.* Birləşmə, ümumiləşmə, qovuşma. [Lətifə:] *Bu cür əsərlər xalq sənəti ilə professional sənətin sintezindən əmələ gəlir*. M.Hüseyn.

2. *kim.* Bəsit maddə və ya elementləri birləşdirmə yolu ilə mürəkkəb kimyəvi birləşmələr alma. *Zülali maddə sintezi. Mürəkkəb üzvi maddələr sintezi.*

**SİNTEZLƏMƏ** "Sintezləmək"dən *f.is.*

**SİNTEZLƏMƏK** b a x **sintezləşdirmək**.

**SİNTEZLƏŞDİRMƏ** "Sintezləşdirmək"dən *f.is.*

**SİNTEZLƏŞDİRMƏK** *f. kim.* Sintez (2-ci mənada) yolu ilə almaq, əldə etmək.

**SİNTOMİSİN** *is. tib.* Antibiotik, levomisetin optik izomer qarışığı.

**SİNUS** [*lat.* sinus – əyrilik] *riyaz.* Bucağın triqonometrik funksiyalarından biri.

**SİONİST** Sionizm hərəkatına mənsub adam, sionizm məsləkində olan adam.

**SİONİZM** [Qüds şəhəri yaxınlığındakı Sion dağının adından] XIX əsrin axırında bir sıra ölkələrin yəhudi burjuaziyası arasında meydana gəlmiş ən mürtəce burjua millətçi hərəkatı.

**SİPƏR** *is.* [*fars.*] 1. Qalxan. *Sipəri üzünə tutmaq. – Dövlətşin başını döndərdi və heç bir məna anlatmayan, donuxmuş gözlərini sipərə zillədi.* Çəmənzəminli.

2. Qoruyucu vasitə kimi istifadə edilən hər cür şey, qurğu və s. *Yurdumuzun solu, sağı; Hər qaya bir sipər bizə*. A.Şaiq. □ **Sipər etmək** – qorunmaq üçün qabağa vermək. [Mehriban] *başını sağ tərəfinə əyərək iki əlini qarşısına sipər edib qışqırmağa başladı.* S.Hüseyn. // İstehkamda əsgəri düşmən mərmisindən və s.-dən qoruyan sədd, xəndək və s. // *tex.* Qoruyucu, pərdə. *Elektrotutucunun sipəri. Qurğuşun sipər.*

◊ **Döşünü (köksünü, sinəsini) sipər etmək (qılmaq)** – mərdcəsinə, qorxmadan mü-

qavimət göstərmək, köks gərmək, özünü qabağa vermək, sinə gərmək. *Zakirəm, sinəmi sipər bəlaya; Qılmışam, at oxun, pənah xudaya*. Q.Zakir. [M.F.Axundzadə:] *Mən sinəmi sizin nasəza sözlərinizə sipər eləmişəm*. Ə.Haqverdiyev.

**SİPƏRLİ** *sif.* Sipər qoyulmuş; sipəri, qoruyucu vasitəsi olan. *Sipərli qurğu.*

**SİRAB** *sif.* [*fars.*] *klas.* Doymuş (su və s. mayelərlə). ☐ **Sirab etmək (eləmək, qılmaq)** – 1) *klas.* doydurmaq (su, şərab və s. ilə). *Yarı gecələr ki çeşmeyi-xab; Gözlər çəmənin qılırdı sirab.* Füzuli. *Demərəm badə ilə et məni sirab, xuda; Bari, çox olmasa da, qismətimiz az olsun*. S.Ə.Şirvani. *Sirab eləyib ləli-ləbin Sabiri, ey şux!* M.Ə.Sabir; 2) bolluca su vermək, su ilə doyuzdurmaq. *Dağın sağ və sol ətəklərindən köpüklənərək sürətlə axan çay axırda iki mehriban qardaş kimi birləşib axaraq, düzlərdə yaşayan əhalinin bağlarını, əkinlərini sirab edir*. Ə.Haqverdiyev. **Sirab olmaq** – doyunca içmək, içib doymaq. *Qoymuşdum evə bir neçə şişə şərab; Yatdım ki, durub sübh olam ondan sirab.* S.Ə.Şirvani. [Mirab:] *Nə danışırsan ə! – deyə, Qədim dayını acıqlı-acıqlı süzdü. – Ağalığın yeri qovrulacaq, armudboğaz Qədim suya sirab olacaq?!* S.Rəhimov. [Mühəndis Fərəcova:] *Yuxarı Qarabağın neçə-neçə kolxozu sirab olacaq.* B.Bayramov.

**SİRAT** *is.* [*ər.*] *klas.* 1. Yol.

2. Dini etiqada görə cəhənnəm üzərində qurulmuş çox dar və keçilməsi çox çətin körpü; qıl körpü (guya məhşər günü adamlar bu körpünün üstündən keçməli olacaq, günahı olanlar cəhənnəmə, günahı olmayanlar isə behiştə vasil olacaqlar). *Mizan, sirat, sual, qəbir əzabı; Bu işlər qabaqda var olacaqdı!* Aşıq Ələsgər.

**SİRAYƏT** *is.* [*ər.*] Yoluxma, keçmə. ☐ **Sirayət etmək** – 1) yoluxmaq, keçmək. *Xəstəlik sirayət etdi. Qrip sirayət edən xəstəlikdir;* 2) keçmək, keçərək yayılmaq. *Səs əvvəl* [Zeynalın] *qulaqlarında əcaib bir halda cingildəyib, cəmi bədəninə sirayət etdi...* Çəmənzəminli. [Əhməd:] *Durduğum yerdə ayaqlarımın xəfifcəsinə əsməsi bütün bədənimə sirayət etmişdi.* T.Ş.Simurq. // Məc. mənada. [Daşdəmirin] *gözlərində və sözlərində elə bir sadəlik və səmimilik vardı ki, bu, dinləyənlərə də sirayət edirdi.* M.Rzaquluzadə. *..Bir anda qızın həyəcanı ovçuya da sirayət elədi, hər ikisi təpədən enib meşəyə sarı yüyürdü.* Ə.Məmmədxanlı. *Səməndərin gülüşü Nərgizə də sirayət elədi*. B.Bayramov.

**SİRAYƏTEDİCİ** *sif.* 1. Keçici, yoluxucu, sirayət edən. [Sərdar:] *Keçəllik, gözağrısı, qızdırma və başqa sirayətedici xəstəliklər xalqı qırıb qurtarır.* P.Makulu.

2. *məc.* Başqalarına tez keçən. *Şirzad mülayim və sirayətedici baxışlarla Pərişanı süzərək sazı aldı və kökləməyə başladı.* M.İbrahimov. *İndi hamı Nərgizin çəngələyib dağıtdığı və anasına göstərdiyi Rəşidin krem çəkilmiş işıldayan saçlarına baxır, sirayətedici qəhqəhədən adamların gözləri yaşarırdı*. Ə.Məmmədxanlı.

**SİRDAŞ** *is.* Bir-birinə ən yaxın, sadiq iki yoldaşdan, dostdan hər biri. *Ataşa Qaçay kimi arxa, Qaçaya Ataş kimi sirdaş lazım idi.* Ə.Vəliyev. *Torpaqlara sinəsinə; Bəzən zülmət gecələrdə; Mən itirdim sirdaşımı*. N.Xəzri. // Məc. mənada. *Mənim bahar adlı bir sirdaşım var; Mən onu anıram, o məni anır*. S.Rüstəm. *Xəyal insanın ən yaxın sirdaşı, məsləhətçisidir.* H.Seyidbəyli.

**SİRENA** *is.* [*fr.*] Müəyyən tezlikli səs rəqslərini almaq üçün akustik şüalandırıcı.

**SİRİMSİMƏK** *f. məh.* Nəmləşmək, nəm çəkmək.

**SİRİŞK** *is.* [*fars.*] *köhn.* 1. Göz yaşı. *Ağlaram bülbül kimi bir gülruxin hicrində mən; Axar ol sərvin ayağınə sirişkim cu kimi.* Ə.Vahid.

2. Damla, zərrə, damcı.

**SİRK** [*lat.* circus – dairə] 1. Akrobatlıq, canbazlıq, ekvilibristika, heyvanat və s. kimi tamaşaları özündə birləşdirən teatr sənəti növü. *Sirkə tamaşa etmək. Sirki sevmək. – ..Elə haman gün Qarabağın qoca və cavan bəyləri* "*Sirk*"*də əvvəlimci cərgədə oturub sirk qızlarına .. tamaşa eləyirdilər.* C.Məmmədquluzadə.

2. İncəsənətin bu növünü nümayiş etdirməklə məşğul olan tamaşa müəssisəsi. *Sirkdə işləmək.* // Tamaşaçıların yerləşməsi üçün amfiteatr şəklində sahəsi olan bina. *Böyük sirk maneji. – Oyunlar çox vaxt .. Nikitin*

*qardaşlarının sirkində.. və bir neçə bu kimi yerlərdə gedirdi.* S.Rəhman.

**SİRKAN** *is. bot.* Sarı çiçəkli kol bitkisi. [Şirzad] *yeridikcə hündür qalxmış qanqal və sirkan kolları qıçına dolaşırdı.* M.İbrahimov.

**SİRKANLIQ** *is.* Çoxlu sirkan bitmiş yer. [Mühəndis Mayaya:] *Bir baxın, hər tərəf boş çöllər, arxlar, sirkanlıqlardır, qabağınıza tülküdən, çaqqaldan çıxar, qorxarsınız.* M.İbrahimov.

**SİRKƏ**[1] *is.* Qıcqırdılmış üzümdən hazırlanan tünd turş şirə. *Sirkə turşusu. Xörəyə sirkə tökmək. Tünd sirkə. – Sirkə tünd olar, öz qabını çatladar.* (Ata. sözü). *Aşıq sözün bitirməz; Ovçu ovun itirməz; Üzüm gündə qalmasa; Dönüb sirkə yetirməz.* (Bayatı).

**SİRKƏ**[2] *is.* Bitin yumurtası.

**SİRKƏLİK** *sif.* Sirkə qoymağa yarayan. *Sirkəlik üzüm.*

**SİRKULYASİYA** *is.* [*lat.*] 1. Fırlanma.

2. Dövr etmə.

**SİRLİ** *sif.* 1. Ürəyində sirri olan. *Sirli adama oxşayır.*

2. Məxfi, gizli, heç kəsin bilmədiyi. *Çıxar sorağına dediyim gözəl; Könlündə sirli, gizli bir əməl.* S.Vurğun. *Xoş bir yel insanı oxşayır, köksünə sirli bir fərəh doldururdu.* Çəmənzəminli. // Əsrarəngiz. *Mən təyyarənin kiçik pəncərəsindən gah əbədi hərəkətdə olan dəryaya, gah da sakit, sirli göylərə baxırdım.* M.İbrahimov.

**SİRLİLİK** *is.* Gizlilik, müəmmalıq, anlaşılmazlıq. *Aldı öz qoynuna budaqlar bizi; Açdıq bu yerdəcə ürəyimizi; Bir sirlilik qalmadı bizim sirdə ki?* N.Xəzri.

**SİRR** *is.* [*ər.*] 1. Başqalarından gizli saxlanılan, başqalarına bildirilməyən, deyilməyən, hamının bilməli olmadığı söz, iş və s. *Ev bizim, sirr bizim.* (Məsəl). [Kəndli Balasultana:] *Sultan ağa, səndən savayı bizim sahibimiz yoxdur və heç bir sirrimiz yoxdur ki, səndən pünhan olsun.* C.Məmmədquluzadə. [Şərif Almaza:] *Biz də deyirik ki, belə olsun ki, sirrimiz bayıra çıxmasın.* C.Cabbarlı. [Südabənin anası:] *Qulaq asın, sizə bir sirr deyəcəyəm.* M.İbrahimov. // Gizli səbəb; bir şeyin daxili, gizli mahiyyəti. *Müvəffəqiyyətin sirri. Qələbənin sirri.*

2. Hələ açılmamış, dərk edilməmiş, öyrənilməmiş bir müəmma kimi qalmış şey. *Təbiətin sirləri. Kosmosun sirləri.* – [Usta Ramazan] *torpağın sirrini öz ürəyinin sirri kimi bilirdi.* M.Hüseyn. *Dünyanın bütün sirlərini öz arzu və əməllərinə görə açan və şərh edən insan özünü bu sirrə də vaqif bilirdi.* M.Rzaquluzadə. // Başqalarının bilmədiyi məlumat, bilik, üsul, yol. *Aktyorluq sənətinin sirlərini bilmək. Öz ixtisasının sirlərini dərindən öyrənmək.*

**SİRRÓZ** *is.* [*yun.*] Orqanın yeni birləşdirici toxuma əmələ gəlməsi nəticəsində böyüyüb bərkiməsi.

**SİR-SİFƏT** *is.* Üz, sifət, üz-göz. *Bir onun sir-sifətinə bax. Sir-sifəti qızarmaq.* – [Səfdərin arvadı:] *Sir-sifətlərini boyamaq* [Zivərgilin] *heç yadlarından çıxmır.* S.Vəliyev. *Səməd diqqətlə .. nə sir-sifətində, nə də xasiyyətində heç bir dəyişiklik olmayan Yusifə baxdı.* İ.Hüseynov. // Üzün ifadəsi. *Sir-sifətindən görünür... Sir-sifətindən bəllidir...* – [Hacı Bayram:] *Sir-sifətindən kamallı oğlana oxşayırdı.* Ə.Haqverdiyev.

◊ **Sir-sifətini turşutmaq (yığmaq)** – b a x **qaşqabağını sallamaq (turşutmaq, tökmək)**. *Alməmmədov indi də ağzında acı bir şey varmış kimi sir-sifətini yığıb tamsınatamsına stolun qırağındakı düyməni basdı.* B.Bayramov. [Məmməd] *nə üçünsə sir-sifətini turşudub üzünü yana çevirdi.* V.Şıxlı.

**SİS, SİS-DUMAN** *is.* Yerə çökmüş buluddan ibarət olan rütubətli duman; çən. *Dağ başına sis gəldi; Ocaq yandı, his gəldi.* (Bayatı). *Gilanın üzərində qalın bir sis, günəşin ziyasına mane ola biləcək kəsif bir kölgə vardı.* S.Hüseyn. *Uca dağların almaz kimi parıldayan qarlı-buzlu təpələrindən sis-duman çəkilir.* M.Rzaquluzadə.

**SİSLİ** *sif.* Çənli, sis basmış, duman basmış. *Qızarırdı daha az-az dan yeri; Açılırdı sisli payız səhəri.* H.K.Sanılı. *Alma, armud, gavalı dənizində batan ağacların arasından uzaqdakı mavi sisli meşə görünürdü.* Çəmənzəminli. *Sisli buludlarla qaralmış bayır; Mürgüləyir dağ, dərə, orman, çayır.* A.Şaiq.

**SİSTÉM** [*yun.* systema – bütöv] 1. Bir şeyin hissələri arasında düzgün, müntəzəm düzülmüş və qarşılıqlı əlaqəyə əsaslanan müəyyən

qayda, üsul. *Kitabxanada kitabların düzülüş sistemi. Hər şeydə səliqə və sistem lazımdır. Yazdıqlarını sistemə salmaq.* // Qəbul edilmiş qayda, üsul. *Attestasiya sistemini tətbiq etmək. Teatrda abunəçilik sistemi. İşçilərin məzuniyyət sisteminə riayət etmək.* // Adi qayda, üsul, nizam. *Qəbul edilmiş sistem üzrə.*

2. *zool. bot.* Təsnifat, qruplaşdırma. *Linneyin nəbatat sistemi.*

3. Hər hansı bir nəzəriyyənin, təlimin əsasını təşkil edən prinsiplərin məcmusu. *Uşinskinin pedaqoji sistemi. Dekartın fəlsəfi sistemi.*

4. Bir şeyin (təsərrüfat, dövlət, siyasi və s. vahidlərinin) təşkilat, quruluş forması. *Dövlət quruluşu sistemi. Məhkəmə sistemi.*

5. Bir-birilə qarşılıqlı surətdə bağlı hissələrdən ibarət struktur, quruluş. *Günəş sistemi. Dilin qrammatik sistemi. Əsəb sistemi. Bitkinin kök sistemi. Qan sistemi.* // *geol.* Qazıntı halında tapılan müəyyən heyvan və bitki qalıqları ilə səciyyələnən süxurların məcmusu. // Təşkilati cəhətdən birləşdirilmiş təsərrüfat, müəssisə, idarə vahidlərinin məcmusundan ibarət struktur. *Xalq maarifi orqanları sistemi. Səhiyyə sistemi. Elmlər akademiyası sistemində işləmək.* // Bir məqsədə xidmət edən mexanizm, maşın və s. vasitələrin qarşılıqlı əlaqəsi məcmusundan ibarət texniki qurğu. *Elektrik şəbəkəsi sistemi. İsitmə* (*qızdırma*) *sistemi.* // Bir-birilə bağlı olan və bir məqsədə xidmət edən maşınların, mexanizmlərin və s.-nin məcmusundan ibarət texniki qurğular.

6. Texniki quruluş prinsipi; konstruksiya. *Avtomat pulemyot sistemi. Hər cür sistemə aid traktorlar.*

**SİSTEMATİ́K** *sif.* [*yun.* systematikos] 1. Müəyyən bir sistem təşkil edən; müəyyən bir plan əsasında qurulmuş, müəyyən sistem üzrə qurulmuş. *Sistematik təsvir. Sistematik kataloq. Sistematik surətdə.*

2. Müəyyən sistemə əsaslanan; tam, ardıcıl, planlı. *Təbii sərvətlərin sistematik tədqiqi. Sistematik təhsil almaq. Xarici dillərin sistematik öyrənilməsi.*

3. Daimi, müntəzəm. *Əməkçilərin həyat səviyyəsinin sistematik yaxşılaşdırılması. Tapşırıqların yerinə yetirilməsini sistematik yoxlamaq.*

**SİSTEMÁTİK** [*yun.*] Sistematika (2-ci mənada) mütəxəssisi.

**SİSTEMÁTİKA** [*yun.*] 1. *xüs.* Hadisələrin, əşyaların təsnifi, qruplaşdırılması. *İzotopların sistematikası.*

2. Botanika və zoologiyanın, bitkilərin və ya heyvanların təsnifi və təsviri ilə məşğul olan bölməsi.

**SİSTEMLƏŞDİRİLMƏ** "Sistemləşdirilmək"dən *f.is. Müşahidələrin sistemləşdirilməsi.*

**SİSTEMLƏŞDİRİLMƏK** *f.* 1. Sistemə salınmaq, nizama salınmaq. *İşlər sistemləşdirildi.*

2. *xüs.* Təsnif edilmək, qruplaşdırılmaq.

**SİSTEMLƏŞDİRMƏ** "Sistemləşdirmək"dən *f.is.*

**SİSTEMLƏŞDİRMƏK** *f.* 1. Sistemə salmaq, nizama salmaq. *Əsərin materiallarını sistemləşdirmək. Təcrübəni sistemləşdirmək.*

2. Təsnif etmək, qruplaşdırmaq. *İzotopları sistemləşdirmək.*

**SİSTEMLİ** *sif.* 1. Hər hansı sistemə aid olan, sistem mahiyyətində olan. // Müəyyən sistem üzrə qayrılmış. *..Zirzəmidən on iki dənə cürbəcür sistemli tapança tapmışdılar.* H.Seyidbəyli.

2. B a x **sistematik** 2-ci mənada. *Sistemli iş.*

**SİSTEMLİLİK** *is.* Sistemli şeyin halı, xassəsi, keyfiyyəti; bir şeydə sistem olması; müntəzəmlik. *İşdə sistemlilik. Qayda və sistemlilik müvəffəqiyyətin başlıca şərtlərindən biridir.*

**SİSTEMSİZ** *sif.* və *zərf* Heç bir sistemi, planı olmayan, heç bir sistemə riayət etməyən; plansız, qaydasız, nizamsız, tərtibsiz. *Sistemsiz adam. Sistemsiz oxumaq. Sistemsiz işləmək.*

**SİSTEMSİZLİK** *is.* İşdə müəyyən sistem olmadığı hal; plansızlıq, qaydasızlıq, nizamsızlıq, tərtibsizlik. *İşdə sistemsizlik. Sistemsizliyi aradan qaldırmaq.*

**SİSTÉRN** [*lat.* cisterna – hovuz] Neft, benzin və s. mayeləri saxlamaq və ya daşımaq üçün böyük çən, habelə belə çəni olan vaqon, avtomobil və s. *Dəmiryol sisternləri. Neft sisterni.* – [Zakirlə Mehriban] *sistern vaqonunu andıran ağ, uzunsov bir çənin yanında dayandılar.* H.Seyidbəyli. *Böyük bir meydançada*

*yerləşən avtobatalyonda bir-birindən aralı iyirmi sistern vardı.* S.Vəliyev.

**SİSTİT** *is.* [*yun.*] Sidik kisəsinin iltihabı xəstəliyi.

**SİTAL** *sif.* Sırtıq, üzlü, nadinc. [Mələk:] *Bəs deyil? Sital uşağı sital, lap zəhləmi tökdünüz.* Çəmənzəminli.

**SİTALLAŞMA** "Sitallaşmaq"dan *f.is.*

**SİTALLAŞMAQ** b a x **sırtıqlaşmaq**.

**SİTALLIQ** b a x **sırtıqlıq**. *Kirəçi sitallığa salıb, otaqda qalır və normaya görə də aylıq verirdi.* Çəmənzəminli.

**SİTARƏ** *is.* [*ər.*] *klas. şair.* Ulduz. *Ey bəxtimin sitarəsi, bu sübh açılmasın; Mahi-rüxun yetər bu gecə karivanə şəm!* S.Ə.Şirvani. *Camalın atəşinə ay və gün deyən çox olub; Üzündə xalına yanmış sitarə mən demişəm.* Ə.Vahid.

**SİTÁT** [*lat.* citatum] Olduğu kimi, hərfi-hərfinə bir mətndən götürülmüş yazı. *Klassiklərdən götürülən sitatlar. Bədii əsərlərdən sitat seçmək.*

**SİTATBAZ** *is.* [*lat.* citatum və *fars.* ...baz] Yazısında, nitqində sitat gətirməyi sevən adam, sitat həvəskarı; sitatçı.

**SİTATBAZLIQ** *is.* Həddindən artıq sitat gətirməyi sevmə, sitat həvəskarı olma, sitatçılıq.

**SİTATÇI** b a x **sitatbaz**.

**SİTATÇILIQ** b a x **sitatbazlıq**.

**SİTAYİŞ** *is.* [*fars.*] Pərəstiş, tapınma; dərin ehtiram, hörmət. ☐ **Sitayiş etmək** – 1) ibadət etmək, pərəstiş etmək, tapınmaq, ilahiləşdirmək. *Hələ tarixi-miladidən çox-çox əvvəl atəşpərəstlik meydana çıxdığı zaman bizim qədim babalarımız bir sıra atəşgahlar qurub, oda sitayiş edərlərmiş.* M.Hüseyn. *Deyirlər, Hindistanda indi də öküzə sitayiş edən tayfalar var.* M.Rzaquluzadə; 2) bir şəxsi və ya bir şeyi pərəstiş dərəcəsində sevmək, dərin ehtiram əlaməti olaraq qabağında səcdə etmək, pərəstiş etmək, məftun olmaq. *Bax, mən səni bu saat başa salım; bax, bu evdə üç qisim kitab var, biz üç qardaş bunlara sitayiş edirik.* C.Məmmədquluzadə.

**SİTƏM** *is.* [*fars.*] *klas.* Zülm, əziyyət, cəfa. [Sənəm:] *Lənət olsun o günlərə, o dəmə! Yazıq canım necə dözsün sitəmə?* "Aşıq Qərib". *Çərxin sitəmindən, dövrün zülmündən; Tökülər dəmbədəm yaşım, ağlaram.* Q.Zakir. ☐ **Sitəm etmək (qılmaq)** – zülm etmək, əziyyət vermək, cəfa vermək. *Ey ağalar, necə sitəm etdilər; Vaqifin canını çox incitdilər.* M.P.Vaqif. [Nazlı Ağabəyimə:] *Təzə arvad günüsündən hər gün ərinə bir söz deyir, əri də yazıq arvada sitəm eləyirmiş.* Çəmənzəminli.

**SİTƏMKAR** *is.* [*fars.*] *klas.* Zülm edən, əziyyət verən, incidən; zülmkar. *Badi-səba, söylə ol sitəmkara; Ölürəm, eyləsin dərdimə çara!* Q.Zakir. *Bu çərxi-sitəmkarın aman məsxərəsindən! Bais, yalan olsun!* M.Ə.Sabir.

**SİTƏMLİ** *sif.* Əziyyət çəkən, zülm çəkən; məzlum. *Sitəmli kəndlərdən qaçarkən dağa; Rast gəlib qozluqda bu yığıncağa.* H.K.Sanılı. *Mən ana görürəm yuxuda tez-tez; Gözləri qayğılı, könlü sitəmli.* Ə.Kürçaylı.

**SİTOGENÉTİKA** *is.* [*yun.*] İrsiyyətin qanunauyğunluqlarını hüceyrədaxili komponentlərin quruluş və funksiyası ilə əlaqəli surətdə öyrənən elm.

**SÍTRA** *is.* [*alm.*] Mizrabla çalınan simli musiqi aləti.

**SİTRAMÓN** *is. tib.* Tərkibində aspirin, fenasenin, kofein, kakao, limon turşusu və şəkər olan ağrıkəsici dərman.

**SÍTRUS** is [*lat.*] *bot.* İsti ölkələrdə yayılmış və tərkibində efir yağları olan, qabıqlı iri meyvələri olan kol və ya ağac (sitruslara portağal, limon, mandarin və s. aiddir). *Sitrus cinsinin limon, naringi, portağal və sair növləri ağac və kollardır.* M.Qasımov. *Divarlarda .. sitrus bitkilərinin becərilməsi haqqında təlimatlar.. asılmışdı.* H.Seyidbəyli.

**SİTRUSÇU** *is.* Sitrus bitkiləri mütəxəssisi; sitrus bitkiləri becərən adam.

**SİTRUSÇULUQ** *is.* Sitrus becərmə işi, sitrus yetişdirməklə məşğul olma.

**SİTUASİYA** *is.* [*fr.*] Vəziyyət, şərait, hadisələrin gedişi.

**SİVÍL** [*lat.*] Mülki, qeyri-hərbi. *..Hücrənin ətrafında yüz nəfərə qədər sivil paltarında mühafizəçilər gəzirdi..* M.S.Ordubadi. *..Zabitlər və sivil paltarlı saray adamları qonaqları böyük ehtiramla qəbul edib, onlara hər cür qulluq göstərməyə çalışırdılar.* P.Makulu.

**SİVİŞGƏN** *sif.* Sürüşkən.

**SİVİŞGƏNLİK** *sif.* Sürüşkənlik.

**SİVİŞMƏ** "Sivişmək"dən *f.is.*

**SİVİŞMƏK** *f.* 1. Sürüşmək, sürüşüb çıxmaq. *Qız sivişib* [Mübaşir Məmmədin] *qolları arasından çıxdı, otağın ortasında durub gözünün içinə baxdı*. M.İbrahimov.

2. Gizlincə çıxıb getmək, ötüb keçmək, aradan çıxmaq, qaçıb yaxasını qurtarmaq. *Şahmar Xəlilin əlindən belə asanlıqla yaxa qurtardığına sevinib, yavaşcadan Əlyarovun böyründən sivişərək o biri otağa keçdi.* M.Hüseyn. [Şirkət idarəsi] *yanından keçərkən yenə iki itin sivişib həmin dəhlizə girdiyini gördüm*. Ə.Məmmədxanlı.

**SİVRİ** *sif.* İti, şiş. *Sivri qılınc. Sivri burun. – Zehnin, düşüncənin səyyar qanadı; Sivri bir ox kimi sancıldı yerə*. S.Vurğun. [Firəngizin] *sivri burnundan geniş, qaraşın alnına ağ bir keçid vardı*. B.Bayramov. [Səməndər] *bulaşmış barmaqları ilə tez-tez alnını eşir, hələ də uşaqlıq şəklini itirməmiş sivri çənəsini ovuşdururdu*. Q.İlkin.

**SİVRİBURUN(LU)** *sif.* Burnu sivri, iti olan. *Sivriburun balıq*.

**SİVRİLƏŞMƏ** "Sivriləşmək"dən *f.is.*

**SİVRİLƏŞMƏK** *f.* Sivri şəkil almaq, sivri olmaq, ucu nazikləşmək. *Şiddətli küləklərin nəticəsində qayalar get-gedə sivriləşirdi.* S.Vəliyev.

**SİVRİUCLU** *sif.* Ucu sivri olan, itiuclu, şişuclu. *Sivriuclu nizə. – Telli arvad cavab verməyib, köynəyinin ətəyini yığışdırdı, bürmələyib büzməli tumanının içinə saldı, sivriuclu beli götürüb Qızyetərə baxdı: – Hardan başlayaq, manqabaşçısı?* Ə.Vəliyev.

**SİVRİYARPAQ(LI)** *sif.* Yarpaqları sivri, ucu getdikcə iti, şiş olan. *Sivriyarpaqlı ağcaqayın*.

**SİYAH** [*fars.*] *klas.* Qara. *Səf-səf duran siyah kirpiklərindir; Yoxsa ki gözümə millər görünür?* M.P.Vaqif.

**SİYAHI** *is.* [*fars.*] Üzərində sıra ilə adlar sadalanmış, yazılmış kağız və s. *Şagirdlərin siyahısı. Kitabların siyahısı. Evlərin siyahısı. Seçicilərin siyahısı.* – [Məhərrəm bəy:] *..Atamın siyahı dəftəri əlimə düşdü*. S.S.Axundov. *Qonaqların siyahısı otuz nəfərə çatanda Tərlanovun arvadı deyinməyə başlamışdı.* H.Seyidbəyli. ☐ **Siyahı tutmaq** – bir-bir, sıra ilə adları kağız üzərində yazmaq, sıralamaq. *Kitabların siyahısını tutmaq. Gələnlərin siyahısını tutmaq.* **Siyahıya almaq (vurmaq, götürmək)** – b a x **siyahı tutmaq**. [Oğlan:] *Varlıların, tacirlərin, mülk sahiblərinin var-yoxlarını siyahıya vurub əllərindən alıblar.* Ə.Haqverdiyev. [Nuriyyə:] *Balaca bir kataloq düzəltmək üçün kitabları yenidən siyahıya aldım.* İ.Əfəndiyev. [Məmməd İsmayılov:] *Elə isə, Murad, götür siyahıya, Hüseyn Xələfov.* S.Rəhman.

**SİYAHIYAALMA** *is.* Hər hansı bir şeyin kütləvi şəkildə qeydə alınması işi.

**SİYAL** *is. məh.* Üzümdə güllləmə xəstəliyi.

**SİYASƏT** *is.* [*ər.*] 1. Dövlətin, partiyanın və ya hər hansı bir ictimai qrupun daxili dövlət və ya beynəlxalq münasibət məsələlərində öz sinfi mənafeyinə uyğun fəaliyyəti. *Dövlətin daxili siyasəti.*

2. *dan.* İnqilabi işdə, inqilab hərəkatında iştirak etmə. *Siyasət üstündə tutulmaq*.

3. Canlı dildə: hiylə, fənd; biclik, hiyləbazlıq, fəndgirlik mənasında. *Siyasət işlətmək.*

4. *klas.* Cəza, tənbeh, cəza vermə. ☐ **Siyasət eyləmək (etmək)** *klas.* – cəzalandırmaq. *Neylərsən əgər atan eşitsə; Qəhr ilə sənə siyasət etsə?* Füzuli. *Üzündən göz götürməm, eyləsən yüz min siyasətlər*. Q.Zakir.

**SİYASƏTBAZ** *is.* [*ər.* siyasət və *fars.* ...baz] Prinsipsiz siyasətçi, öz məqsədinə çatmaq üçün heç bir vasitədən çəkinməyən adam. *Burjua siyasətbazları*.

**SİYASƏTBAZLIQ** *is.* Siyasətbaz adamın iş və hərəkəti. *Siyasətbazlıq etmək*.

**SİYASƏTÇİ** *is.* 1. Siyasət məsələləri ilə məşğul olan adam, siyasi xadim. *Uzaqgörən siyasətçi. Tərəqqipərvər siyasətçilər.* – [Dilara Bəhruza:] *Mən nə mübariz, nə də siyasətçiyəm, əzizim!* Ə.Məmmədxanlı. // *isteh*. Siyasət məsələləri ilə çox maraqlanan, siyasətdən dəm vurmağı sevən adam.

2. *dan.* Çox məharətlə iş görən, bic, fəndgir, hiyləgər adam haqqında. *Yaman siyasətçidir*.

**SİYASİ** *sif.* [*ər.*] 1. Siyasətlə bağlı, siyasətə aid olan, siyasəti həyata keçirməklə bağlı olan. *Kütlələrin siyasi aktivliyi. Siyasi fəaliyyət. Siyasi sayıqlıq. Siyasi görüş dairəsi. – Dilbər nahar fasilələrində kolxozçulara qəzet oxuyur, ictimai və siyasi mövzularda söhbətlər edirdi.* Ə.Sadıq.

2. Dövləti-hüquqi. *Siyasi quruluş. Siyasi rejim. Siyasi sistem.*

3. İnqilabi hərəkatda iştirakına görə həbs (sürgün) edilmiş. *Siyasi dustaq.*

**SİYENA** *is.* [*xüs. is.*-dən] Açıq-qəhvəyi rəngdə təbii piqment.

**SİYENİT** *is.* [*yun.*] Tam kristal süxur.

**SİYƏNƏK** *is.* Əsasən duzlanmış və hisdə qurudulmuş halda yeyilən xırda dəniz balığı. *Xəzər-Qaradəniz siyənəkləri.*

**SİYİMƏ** "Siyimək"dən *f.is.*

**SİYİMƏK** *f.* İşəmək.

**SİYİRMƏ¹** "Siyirmək"dən *f.is.*

**SİYİRMƏ²** *is.* Stolda, şkafda və s.-də giribçıxan yeşik; göz. *Komodun siyirməsi. Şkafın siyirməsi. – ..Xəlil qürurla düşündü və kitabı stolun orta siyirməsinə qoyub ayağa qalxdı.* M.Hüseyn. *Veys .. haqq-hesab və nisyə dəftərləri qoyulan siyirməni çəkdi.* Ə.Əbülhəsən. *Sultan siyirməni açıb dərman çıxartdı.* İ.Hüseynov.

**SİYİRMƏ³** *is.* Qapını, pəncərəni bağlamaq üçün hər iki tərəfdən halqalara keçirilib, irəli-geri hərəkət etdirilə bilən ağac, dəmir parçası və s. *Qapının siyirməsini vurmaq.*

**SİYİRMƏK** *f.* 1. Şiddətlə toxunaraq, sürtünərək üzərindən qoparmaq, soymaq, aparmaq, cızmaq, qabığını çıxartmaq. *Daş dizimi siyirdi. Ağac qolumu siyirdi.*

2. Qabda qalan yemək qalığını çörək və ya barmaqla silib təmizləmək. *Boşqabı siyirmək. Qazanın dibini siyirmək. Nimçədəki xörəyi siyirmək.*

3. Qınından çəkərək çıxarmaq. *Xəncəri siyirmək. Qılıncı siyirmək.* – [İgid] *Siyirə qılıncı, çəkə qalxanı! Səksən oxu sadağından boşana.* "Koroğlu". *Cəllad gəlib, qılıncı siyirib hazır durur.* Ü.Hacıbəyov. [Katib:] *..Sonra da xəncərimizi siyirib, Dövlətin evinə* (*gedək*). Ə.Əbülhəsən. // *məc.* Ölümlə hədələmək, öldürməyə amadə olmaq. *İndi azar soxulub; İliyinə, qanına; Ölüm qılınc siyirib; Həyat qəhrəmanına.* R.Rza.

4. Əynindən sürüşdürüb salmaq, çıxartmaq. [Nərgiz] ..[plaşını] *siyirib otun üstünə saldı.* B.Bayramov.

5. Üzüb atmaq, kəsmək. ..[Kovxa] *belindəki xəncərini çəkib xoruzun başını siyirdi.* S.Rəhimov.

◊ **Ürəyini siyirmək** – b a x **ürək**.

**SİYİRMƏQILINC** *zərf* Qınından çıxarılmış halda, qılıncla, yalınqılınc. *Siyirməqılınc hücuma keçmək. – Fəxrəddin əlində siyirməqılınc atlının qabağında göründü.* M.S.Ordubadi. *Karetadan siyirməqılınc iki soldat çıxdı.* M.İbrahimov.

◊ **Siyirməqılınc eləmək** – aradakı düşmənçiliyi, ədavəti, ziddiyyəti daha da kəskinləşdirmək; düşmən etmək. *Gədə, niyə bunları mənimlə siyirməqılınc eləyirsən?* M.İbrahimov.

**SİYİTMƏK** *icb.* İşətmək.

**SİYRİLMƏ** "Siyrilmək"dən *f.is.*

**SİYRİLMƏK** *f.* 1. Dərisi soyulmaq, dərisi qopmaq. *Yerə dəyib dizi siyrildi.* // Sürtünüb getmək, yeyilmək. *Əyilmiş çəkmənin nalı, dabanı; Siyrilib papağın o yan-bu yanı.* H.K.Sanılı.

2. Qınından çıxarılmaq. *Qılınclar siyrildi.*

3. Sürüşmək, sürüşüb düşmək. *..Sona da indi dönüb bayaqkı yerində dayanmış, başından siyrilib çiyninə düşən ağ torunun ipək saçları ilə oynayırdı.* Ə.Əbülhəsən.

4. Bir şeyin arasından, altından görünmək, bir şeyi yararaq çıxmaq. *Kələ-kötür ocaq daşlarının arasından siyrilən* (f.sif.) *qırmızı dilli alov gecənin qaranlığını yararaq nəhayətsiz səhrada itirdi.* M.İbrahimov. *Üçgünlük ay bulud bölüyünün altından siyrilib çıxırdı.* B.Bayramov.

5. Açılmaq, aralanmaq. *Buludun pərdəsi siyrildi bir az.* R.Rza. *Oyan, bu yatdığın yuxudan oyan! Siyrilsin pərdələr, açılsın müşkül.* M.Rahim.

**SİYRİNTİ** *is.* Siyrilmiş, qopmuş, soyulmuş şey. *Uşağın qolunda siyrinti var.*

**SİZ** İkinci şəxs əvəzliyinin cəmi; çox və ya bir neçə adama, həmçinin hörmət olaraq bir adama müraciət forması. *Sizi bu gün gözləyirik. Siz sabahkı tamaşaya gələcəksiniz?* – [Mərcan bəy:] *Təzə arvad alıram, ona görə sizin hərənizə bir abbası pul bağışlayacağam.* Ü.Hacıbəyov. *Bir sözüm iz salsa ürəyinizdə; Bilin, mənim deyil, o da sizindir!* N.Xəzri.

**SİZAL** [*xüs. is.*-dən] Tor, kanat və s. hazırlanmasında istifadə olunan qaba toxuculuq lifi.

**SİZCƏ** *əvəz.* Sizin fikrinizcə. *Sizcə yağacaq? Sizcə yarışda kim qalib gələcək?* // Müsahibin fikrincə, istəyinə, arzusuna uyğun. *Qoy sizcə olsun.*

**SİZİNKİ** *əvəz.* 1. Sizə məxsus olan, sizə aid olan. *O kitablar sizinkidir. – Şirvanın şirin narı; Dadlıdır şirin narı; Sizinki sizin olsun; Göndərin bizim yarı.* (Bayatı).

2. İs. mənasında, adətən cəm şəklində: **sizinkilər** – sizə yaxın olanlar (qohumlar), sizinlə bir yerdə olanlar, sizin ailənin üzvləri, sizin adamlar. *Sizinkilər axşam teatrda idilər.*

**SİZLİ-BİZLİ** *əvəz.* Siz və biz birlikdə, həm siz, həm biz, hamımız bir yerdə. *Sizli-bizli bu işi düzəldək.* – [Əjdər müəllim:] *Mən deyirəm, elə olsun, hərtərəfli, sizli-bizli bu balaca Cəmişə kömək edək.* S.Rəhimov.

**SKAFÁNDR** *is.* [*fr.*] 1. Dalğıc geyimi.

2. Stratonavt geyimi.

3. Kosmos uçuşları üçün geyim.

**SKAMYÁ** [*rus.*] Üstündə oturmaq üçün dayaqlar üzərində düzəldilmiş söykənəcəkli kürsü. *Bir ağacın altında skamyanın üstünə; Qəzet salıb oturmuş bir gözəl sarışın qız.* S.Rüstəm. *..Fəridə Zərifə ilə bulvarda, skamyada əyləşmişdi.* S.Vəliyev.

◊ **Məktəb (institut və s.) skamyasında** – hələ məktəbdə (institutda və s.-də) oxuyarkən, oxuduğu zaman. **Məktəb (institut və s.) skamyasından** – məktəbi (institutu və s.-ni) qurtaran kimi. **Müttəhimlər skamyası** – məhkəmə salonunda müttəhimlərin oturması üçün ayrılmış yer. **Müttəhimlər skamyasında oturmaq** – məhkəməyə düşmək, məhkəmədə işinə baxılmaq.

**SKARLATÍN** [*ital.* scarlattina – qıpqırmızı] *tib.* Boğazda ağrı və bədəndə qırmızı səpgilər şəklində təzahür edən, əksəriyyətlə uşaqları tutan çox yoluxucu xəstəlik.

**SKELÉT** [*yun.* skeleton – qurumuş bədən] 1. İnsan və onurğalı heyvan bədəninin əsasını, gövdəsini təşkil edən sümüklərin hamısı bir yerdə. *İnsan skeleti. Quş skeleti. At skeleti.* // *məc.* Müqayisələrdə – quru cəsəd, bir dəri, bir sümük (çox arıq adam haqqında). [Gülara] *zəiflikdən bir skelet şəklini almışdı.* Ə.Vəliyev. [Zərqələmin] *anası sanki canlı deyil, bir skelet idi.* Ə.Sadıq. ◻ **Skeletə dönmək** – son dərəcə arıqlamaq, bir sümük, bir dəri qalmaq. *Lap skeletə dönüb.*

2. Bir şeyin əsası, gövdəsi, özülü. *Yanmış buruqların skeleti çar xəyanətinin qara heykəli kimi baxırdı.* M.S.Ordubadi.

3. *məc.* Sonradan inkişaf etdiriləcək və ya qurulacaq bir şeyin əsasını, ən mühüm hissəsini təşkil edən cəhət. *Əsərin skeleti hazırdır.*

**SKÉPTİK** *is.* [*yun.*] 1. Skeptisizm tərəfdarı.

2. Hər şeydən şübhələnən adam, hər şeyə şübhə ilə baxan adam; şəkkak.

**SKEPTİSÍZM** [*yun.* skepsis – baxma] 1. Obyektiv varlığın insan tərəfindən gerçək dərk edilə bilməsini inkar edən idealist fəlsəfi cərəyan. *Qədim yunan fəlsəfi cərəyanlarından biri skeptisizmdir.*

2. Hər şeyə tənqidlə, şübhə ilə baxma, hər şeyə şəkk etmə, bir şeyin varlığına, gerçəkliyinə şübhə etmə; şəkkaklıq. *Xanım danışdıqca, elə bil.. rasionalizm və skeptisizm zəncirlərini qırır, sanki Muxtar yüngül-yüngül nəfəs almağa başlayırdı*. Çəmənzəminli.

**SKETÇ** *is.* [*ing.*] Estrada üçün yazılmış kiçik məzhəkə.

**SKÍFLƏR** Eramızdan əvvəl VII əsrdən eramızın III əsrinə qədər Qara dənizin şimalında yaşamış müxtəlif köçəri xalqların ümumi adı.

**SKİPİDÁR** [*rus.*] İynəyarpaqlı ağacların qatranından hasil edilən kəskin iyli, rəngsiz və sarımtıl rəngli maye maddə (təbabətdə, lak-boya emalında işlənir).

**SKLÉRA** *is*. [*yun.*] Göz almasının qeyri-şəffaf xarici qişası.

**SKLERÍT** *is.* Göz ağı qişasının iltihabı.

**SKLERÓZ** [*yun.* skleros – bərk] Bədənin müxtəlif orqanlarında bu və ya digər spesifik elementin azalması və onu birləşdirici sərt toxuma əvəz etməsi nəticəsində təzahür edən xəstəlik prosesi. *Ürək sklerozu. Beyin damarları sklerozu.*

**SKLEROZLU** *sif.* Sklerozu olan.

**SKRÍPKA** [*rus.*] Diapazon cəhətcə ən yüksək olan, yayla çalınan dördsimli musiqi aləti. *Daşıdığı adından bəlli olduğu kimi, simli orkestrin tərkibi yalnız simli musiqi alətlərindən* (*skripka, alt, violonçel və kontrabas*) *ibarətdir*. Ə.Bədəlbəyli. *Sarışın, gödəkboy bir oğlan özü ilə bir skripka gətirmişdi*. Ə.Sadıq.

**SKRİPKAÇALAN, SKRİPKAÇI** *is.* Skripkada çalan musiqiçi.

**SKÚMBRİYA** *is.* [*yun.*] Dəniz balığı.

**SKÚTER** *is.* [*ing.*] Daxiliyanma mühərriki ilə işləyən bir yerli idman qayığı.

**SLÁLOM** *is.* [*norveç.*] Dağ-xizək idmanında qarlı dağ enişində bayraqlarla göstərilmiş "qapılardan" keçməklə dolanbac yolun qət edilməsi.

**SLAVYANÍZM** *is. dilç.* 1. Hər hansı bir slavyan dilindən qeyri-slavyan dilinə keçmiş söz və ya ifadə.

2. Qədim slavyan dilindən rus dilinə keçmiş söz və ya ifadə.

**SLAVYÁNLAR** *cəm* Avropada yaşayan, dil və mədəniyyətcə bir-birinə yaxın böyük xalqlar qrupu. Slavyanlar üç qola bölünür: şərqi slavyanlar (ruslar, ukraynalılar, beloruslar), qərbi slavyanlar (polyaklar, çexlər, slovaklar, lujiçanlar), cənubi slavyanlar (bolqarlar, serblər, xorvatlar, slovenlər, makedoniyalılar).

**SLAVYANLAŞDIRMA** "Slavyanlaşdırmaq"dan *f.is.*

**SLAVYANLAŞDIRMAQ** *f.* Dil, adət cəhətdən slavyan etmək; slavyan xarakteri, şəkli vermək.

**SLAVYANLAŞMA** "Slavyanlaşmaq"dan *f.is.*

**SLAVYANLAŞMAQ** *f.* Dil və adət və s. cəhətdən slavyan olmaq.

**SLAVYANLAŞMIŞ** *f.sif.* Dil, adət və s. cəhətdən slavyan olmuş.

**SLAVYANŞÜNAS** *is.* Slavyanşünaslıq mütəxəssisi.

**SLAVYANŞÜNASLIQ** *is.* Slavyan dillərini, ədəbiyyatını, mədəniyyətini, tarixini, onların adətlərini tədqiq edən elmlərin məcmusu.

**SLAYD** *is.* [*ing.*] Proyeksiya fanarı vasitəsilə göstərilmək üçün şüşə və s. üzərinə salınan şəkil.

**SLƏNQ** *is.* [*ing.*] Jarqon.

**SLOVAKCA** *sif.* və *zərf* Slovak dilində. *Slovakca əsər. Slovakca danışmaq.*

**SLOVÁKLAR** *cəm* Çexoslovakiya Respublikasının tərkibinə daxil olan Slovakiyanın əsas əhalisini təşkil edən qərbi slavyan xalqı.

**SLOVENCƏ** *sif.* və *zərf* Sloven dilində. *Slovencə danışmaq.*

**SLOVÉNLƏR** *cəm* Yuqoslaviyanın tərkibinə daxil olan Sloveniyanın əsas əhalisini təşkil edən cənubi slavyan xalqı.

**SMETA** *is.* Nəzərdə tutulan çıxar və gəlirin hesablanması; bir şeyin təxmini hesablanması. *Smeta tutmaq. – Tikintinin layihə və smetası dövlət tərəfindən təsdiq edilmişdir.* M.Rzaquluzadə. [Mirzə Salman:] *Yox, qızım, sənin maliyyə işlərində heç bir səriştən yoxdur. Smeta gərək bank vasitəsilə yerinə yetsin.* S.Rəhman.

**SMETÁN** [*rus.* сметана] b a x **xama**. *Vera smetanı təzəcə soyumuş isti kartofun üstünə töküb qaşıqla əzir və yeyirdi*. M.S.Ordubadi.

**SNÁYPER** [*ing.* sniper] Mahir atıcı, sərrast nişançı. *Qeyri-ixtiyari olaraq mən* [cavanı] *sərhəd boyunda keşikdə və ya cəbhədə snayper səngərində təsəvvür etdim.* M.Rzaquluzadə. [Əsəd:] *Bizim içərimizdə yaxşı snayperlər var*. S.Vəliyev.

**SOBA** *is.* Mənzili qızdırmaq, üstündə xörək bişirmək üçün damdan hörülmüş və ya metaldan qayrılmış qurğu; peç. *Hollandiya sobası. Rus sobası. Kafelli soba*. – [Müəllim] *sobasını yenidən qalayıb, yatağına uzanmışdı.* S.Hüseyn. *Küncdə .. bir arvad sobanın üstündə xörək bişirirdi*. Çəmənzəminli.

**SÓDA** 1. Texnikada, təbabətdə və məişətdə geniş işlənən bəzi natrium duzları karbohidratlarının adı.

2. Təbabətdə və aşpazlıqda işlədilən ağ toz şəklində natrium-bikarbonat.

**SOFÁ** [*fr.* sofa, əsli *ər.*] Alçaq qoltuğu və söykənəcəyi olan yumşaq divan.

**SOFİ** *is.* [*ər.,* əsli *yun.*] 1. Təsəvvüfə mənsub adam, təsəvvüflə məşğul olan adam (b a x **təsəvvüf**). // Dini ehkamlardan əsla kənara çıxmayan adam; zahid, dindar (müsəlman).

2. *məc.* İkiüzlü, riyakar.

**SOFİLİK** *is.* Dindarlıq, zahidlik.

**SOFÍST** [*yun.* sophistes] 1. Eramızdan əvvəl V-IV əsrlərdə: əsas diqqəti etika, siyasət, idrak nəzəriyyəsi məsələlərinə verən və öz fikirlərini məntiqi dəlillərlə sübut etməkdə ad qazanmış fəlsəfi məktəbin nümayəndəsi olan qədim yunan filosofu.

2. *kit.* Açıqdan-açığa düzgün olmayan fikirləri sofizmlərlə (məntiqcə düzgün görünə bilən hökmlərlə) sübut etməyə çalışan adam. // Səfsətəçi.

**SOFÍSTİKA** 1. Sofistlərin nəzəriyyəsi (b a x **sofist** 1-ci mənada).

2. *kit.* Sofizmlərə əsaslanan mühakimələr, dəlillər, sübutlar; adamı yanılda biləcək sözlər; boş və əsassız sözlər; səfsətə.

**SOFİZM** [*yun.* sophisma] Məntiqcə (zahirən) düzgün görünə bilən, həqiqətdə isə düzgün olmayıb qəsdən adamı yanılda bilən hökm, iddia; səfsətə.

**SOFU** *is.* [*ər.*] Hər şeydən iyrənən, şübhələnən, çəkinən; vasvası adam.

**SOĞAN** *is.* Bostan bitkisi və bu bitkinin lüləşəkilli yeməli yarpaqları və qat-qat qabıqlardan ibarət kökü. *Baş soğan. – Soğan da meyvə cərgəsinə keçdi.* (Məsəl). *Bir dəqiqə əvvəl soyulmuş soğanın acısından* [Xavərnisənin] *gözləri yaşarmışdı.* T.Ş.Simurq. ◊ **Soğan (qabığı) kimi soyulmaq** – var-yoxu tamamilə əlindən çıxmaq və ya əlindən alınmaq; müflisləşmək. *Onlar qarşılarında, əsir düşəndə soğan qabığı kimi soyulan və qılınc yaraları altında əsir düşən qızı deyil, qaragözlü bir Bağdad gözəlini gördülər.* M.S.Ordubadi. [Məşədi Məmməd:] [Qazı] *mənə bir dil tökdü, yazdı, verdi. Soğan kimi soyuldum, gəldim.* R.Əfəndiyev. **Soğan kimi qabığını soymaq** – bütün var-yoxunu əlindən almaq. **Kefinə (ovqatına) soğan doğramaq** – b a x **kef**. **Saqqala soğan doğramaq** – b a x **saqqal**. **Ürəyi soğan kimi soyulmaq** – b a x **ürək**.

**SOĞANAQ** *is. bot.* 1. Bəzi bitkilərin gövdələrinin qalınlaşmış, çox vaxt yumrulaşmış hissəsi. *Lalə soğanağı. Zanbağın soğanağı.*

**SOĞANBOZBAŞI** *is.* Ət əvəzinə yağda qızardılmış soğanla bişirilən duru xörək; bozbaş. *..Hətta soğan belə yox idi ki, Fatma soğanbozbaşı bişirə.* S.Vəliyev.

**SOĞANÇA** *is.* Yağda qızardılmış soğan. *Soğança hazırlamaq. –* [Fərrux:] *Mənzər, soğançanı ayrı qızart, özünü də çox elə.* Ə.Vəliyev.

**SOĞANLI** *sif.* Soğan qatılmış, tərkibində soğan olan, soğanla bişirilmiş.

**SOĞANLIQ** *is.* Soğan əkilmiş yer. *Bostanın bir tərəfi soğanlıqdır.*

**SOĞDİLƏR** *is.* Mərkəzi Asiya və Qazaxıstanda, Savd vilayətində eramızdan əvvəl birinci minilliyin ortalarında məskunlaşmış olan İrandilli xalq.

**SOXMA** "Soxmaq"dan *f.is.*

**SOXMAQ** *f.* 1. Bir şeyin altına, içərisinə, arasına və ya dalına qoymaq, daxil etmək; dar bir yerin içinə qoymaq. *Parçanı dolaba soxmaq. –* [Qız] *məni görüncə yazdığı kağızı kitab altına soxub qalxdı.* M.S.Ordubadi. *Döşəyini söküb paketi yunların arasına soxdu.* H.Nəzərli. // Zorla soxmaq, dürtmək. *Dadaşım məni qalağın içinə soxandan sonra özü də başını uzatdı içəri..* C.Məmmədquluzadə. ☐ **Özünü soxmaq** – zorla girməyə çalışmaq, özünü təpmək, dürtmək, girmək, soxulmaq. *Bir bəhanə gətirməklə özünü o arvad, qız olan məhəlləyə soxardı.* R.Əfəndiyev. [Gülsüm] *birtəhər itdən xilas olub, özünü çörək təndirinə soxdu və dəmir sacı başına çəkdi.* Çəmənzəminli.

2. Salmaq. *Əlimi hinə soxub suyun içindən cücələrin cəmdəklərini bir-bir çıxartdım.* A.Şaiq. [Əşrəf] *əlini sürətlə cibinə soxaraq təhdidamiz: – Musa! – qışqırdı.* H.Cavid.

3. Batırmaq, saplamaq, keçirmək. *Elə bil qıçıma şiş soxdular.*

4. Bir sıra sözlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: baş soxmaq, gözə soxmaq, burun soxmaq.

**SOXULCAN** *is. zool.* Yumşaq, uzun və əksərən yuvarlaq (halqalı) bədənli, torpaq içində, nəm yerlərdə yaşayan qurd.

**SOXULCANAOXŞAR** *sif.* Görünüşcə soxulcana oxşayan. *Soxulcanaoxşar çıxıntı.*

**SOXULMA** "Soxulmaq"dan *f.is.*

**SOXULMAQ** *f.* 1. Özünü soxmaq, dürtmək; təpilmək, girmək. *Sonra obaya gəldik. Sürülərin içinə soxulduq. Quzularla, oğlaqlarla oynadıq.* A.Şaiq. *Lakin dəstəbaşı araya soxulan* (f.sif.) *bu artıq adamı çıxarmaq istədi.* Mir Cəlal.

2. Zorla girmək, basıb girmək. *Özgənin torpaqlarına soxulmaq.*

3. *məc.* Qarışmaq, müdaxilə etmək. *Hər işə soxulmaq.*

**SOXULUŞMA** "Soxuluşmaq"dan *f.is.*

**SOXULUŞMAQ** *f.* Soxulmaq (çoxları haqqında).

**SOXUŞDURMA** "Soxuşdurmaq"dan *f.is.*

**SOXUŞDURMAQ** *f. dan.* 1. B a x **soxmaq** 1-ci mənada.

2. *məc. dan.* Aldadaraq, dilə tutaraq, biclik işlədərək, hiss etdirmədən vermək, ötürmək, başından eləmək.

**SOL** *is.* 1. Bədənin ürək yerləşən tərəfi, bədənin sağ tərəfinin əksinə olan hissəsi. // *sif.* Həmin tərəfdə olan, yerləşən. *Sol əl. Sol ayaq. Sol böyür.* – [Heydərqulunun] *kürəyindən dəyən güllə sol ciyərini parçalayaraq döşündən çıxmışdı.* Ə.Sadıq. *Lakin Yusif yenə də tövbə deməmiş, dəcəlliyini tərgitmək əvəzinə, eşşəkdən yıxılıb sol biləyini sındırmışdı.* İ.Hüseynov. // *sif.* Sağ qola müqabil olan, sol tərəfdə, ya tərəfdən yerləşmiş; sağ müqabili. *Sol tərəfə döndü. Sol cibindən pul çıxartmaq. Kürün sol sahili. – Pərdə qalxmazdan qabaq Əsgər sağ tərəfdə və xalası sol tərəfdə oturublar.* Ü.Hacıbəyov. *Sol divarda bir əl, iki ayaq kölgəsi göründü.* H.Seyidbəyli.

2. *sif.* Siyasi cəhətdən başqalarına görə daha radikal olan (bu məna parlament salonunda radikal və inqilabçı partiyaların üzvlərinin sədrdən sol tərəfdə oturması ənənəsindən gəlmişdir). *Parlamentin sol fraksiyaları.* // Cəm şəklində: **sollar** – sol partiyaların üzvləri, sol partiyaların nümayəndələri. *Səsvermədə sollar iştirak etmədilər. – Biz açarkən bizə düzgün yollar; Sürünür arxada* "*sağlar*", "*sollar*". M.Müşfiq.

3. *sif.* Ancaq üzdən radikal olub, öz mahiyyətlərini inqilabi ibarələrlə gizlədən opportunist. *Sol təmayül.*

**SOLAXAY** *sif.* və *is.* Hər işi sol əli ilə görən, sağ əlinə nisbətən sol əli ilə daha yaxşı yazan, işləyən. *Solaxay adam. Solaxay tələbə. Tarçı solaxaydır.*

**SOLAXAYLIQ** *is.* Solaxay olma.

**SOLA(QA)N** *sif.* Tez solan.

**SOLÇU** *is. fəls.* Öz xırda burjua görüşlərini inqilabi cümləpərdazlıqla gizlədən opportunist.

**SOLÇULUQ** *is.* Solçu mövqeyində durma, solçunun yeritdiyi siyasət, solçunun görüşü; solluq.

**SOLDÁT** [*rus.*] 1. B a x **əsgər**.

2. B a x **valet**.

**SOLDIŞ** *is. etnoqr.* Toy mərasimində bəyin (oğlanın) və ya gəlinin sol tərəfində oturan, yaxud müşayiət edən şəxs. [Bəyin] *yanına öz tay-tuşlarından iki nəfər rəhbər seçilir. Bunun biri sağdış, o biri soldışdır.* R.Əfəndiyev. *Rüxsarə xanım Firəngizin soldışı idi.* T.Ş.Simurq.

**SOLDURMA** "Soldurmaq"dan *f.is.*

**SOLDURMAQ** *f.* Solğun etmək, solğunlaşdırmaq. *Hansı boyalardan vurmuşdu naxış; Soldura bilməmiş onu zaman da.* N.Rəfibəyli. *Payız gəlib .. meşələri solduranda, körpə Bahar daha da təravətlənmişdi.* B.Bayramov.

**SOLFÉCİO** *is.* [*ital.*] *mus.* Musiqini eşitmə və duyma qabiliyyətini inkişaf etdirmək, eləcə də not oxumaq təcrübəsini artırmaq məqsədi daşıyan tədris fənni.

**SOLĞUN** *sif.* 1. Rəngi qaçmış, rəngi solmuş, soluq. *Solğun çöhrə.* – [Ovçunun] *solğun dodaqları əsir, bir-birindən xeyli aralı olan qövsəbənzər qaşları çatılmışdı.* M.Rzaquluzadə. [Mahmudun] *solğun sifəti qızarmışdı.* S.Vəliyev. // Təravəti getmiş, təravətini itirmiş, solmuş, saralmış, ölgün. *Solğun çiçək. Solğun yarpaq.* // *məc.* Pəjmürdə, tutqun, pərişan, dilxor. [Gülüş:] *Sevil, nə üçün belə solğunsan, yoxsa bir yerin ağrıyır?* C.Cabbarlı.

2. Rəngi yaxşı bilinməyən, parıltısı nəzəri cəlb etməyən, ölgün. *Solğun parça. Solğun pərdə.* – [Hacı Qara:] *Rus malı alıram, solğun* (z.) *çıxır, qızılbaş malı alıram, çürük çıxır.* Ə.Haqverdiyev. // Ağarmış, bozarmış, rəngi getmiş. *Orada-burada solğun paltarlı qocalar və arvadlar gözə çarpırdı.* Çəmənzəminli. *Kosa iki əli ilə öz başına bərk bir qapaz vurdu. Onun solğun kepkasının burnu öz burnu ilə qoşalaşdı.* S.Rəhimov. // Parıltısız, tutqun, işığı zəifləmiş, ölgün. *Solğun şəfəq. Solğun işıq. – Bəzən də göyləri gəzən solğun ay; Yarıb buludları hücuma çıxır.* S.Vurğun. *Günəş solğun, üfüq də tutulmuş kimi dərdə; Orda sarı buludlar sallanır pərdə-pərdə.* M.Müşfiq.

3. *məc.* Dili, üslubu təsirli, ifadəli olmayan; çox zəif. *Solğun tərcümə. Əsərin solğun dili var.*

**SOLĞUNLAŞMA** "Solğunlaşmaq"dan *f.is.*

**SOLĞUNLAŞMAQ** *f.* 1. Rəngi solmaq, solğun olmaq. *Üzü solğunlaşmaq.* – [Bibixanımın] *solğunlaşıb altı kölgələnən gözləri elə bil yenidən canlandı.* B.Bayramov.

2. *məc.* İfadəsini, təsirini itirmək, cılızlaşmaq. *Xüsusən sona, finala doğru obrazlar solğunlaşır, dialoqlar təravətini, təzəliyini itirib adiləşir.* S.Rəhman.

**SOLĞUNLUQ** *is.* Solğun olma, saralma, rəngi qaçma, solğun şeyin halı. *Lakin onun*

*sifətində bir solğunluq nişanı var; Məncə onun bu dərdini dərd çəkənlər duyub anlar.* S.Vurğun. *Çimnaz arvad da gecə yatmadığından çox solğundu və bu solğunluğu ağbirçək, kiçik arvada çox yaraşır, onun qara qaş-gözünü daha gözəgəlimli göstərirdi.* Ə.Əbülhəsən.

**SOLİST** [*ital.*] Solo ifa edən müğənni, rəqqasə və ya çalğıçı.

**SOLLAŞMA** "Sollaşmaq"dan *f.is.*

**SOLLAŞMAQ** *f.* Siyasi görüşcə sol partiyalara yaxınlaşmaq.

**SOLLUQ** b a x **solçuluq**.

**SOLMAQ** *f.* Rəngi qaçmaq, rəngini, parlaqlığını itirmək, saralmaq, təravətini itirmək. *Payız gəldi, yarpaqlar soldu. Gülü suya qoymasan solar.* – [Xuraman:] *Külək əsər, yarpaq düşər, çiçək solar; Viran qalmış mənim bu can otağımdan..* S.Vurğun. *Kosanın bostanında xiyar tağları saralır, göy gülbəsərləri solurdu.* S.Rəhimov. // Ağarmaq, bozarmaq, rəngini itirmək. *Paltar günün altında geyinməkdən solub.* // *Məc. mənada.* Adam haqqında. [Sənəm Züleyxaya:] *Bir ildir gəlin gəlmisən, hələ səni şad görməmişik, .. dərd çəkməkdən gül kimi solmusan.* Çəmənzəminli. [Asya və Telli:] *Niyə solmuş rüxsarın; Gül-çöhrə, tez söylə.* Ü.Hacıbəyov. *Elə bir vaxt oldu ki, qız solmağa, çirkinləşməyə üz qoydu.* M.Hüseyn.

**SOLMAZ** *sif.* 1. Solmayan, təravətini itirməyən. *Solmaz çiçək.* – *Siz bu xalıların parlaq və solmaz naxışlarında böyük bir xalqın arzularını, faciəsini, sevinclərini görə bilərsiniz.* M.İbrahimov.

2. *məc.* Həmişəyaşar, unudulmaz, əbədi.

**SOLO** [*ital.* Solo – tək] Bir çalğıçı, bir müğənni tərəfindən ifa olunan musiqi əsəri və ya onun ayrıca bir hissəsi. *Tarda solo. Skripkada solo çalmaq.* – "*Koroğlu*" *operasının üçüncü pərdəsində Çənlibeldə toplanmış Koroğlu dəstəsinin igidləri hərbi rəqs ifa edərkən, bu musiqinin solo hissəsi orkestrin müşayiəti ilə zurnada ifa edilir.* Ə.Bədəlbəyli. // Bir rəqqas tərəfindən ifa edilən rəqs və ya onun ayrıca partiyası.

**SOLTAN** *is.* [*ər.* sultan] Padşah, hökmdar. *Hər kimin ki, mövla olur köməyi; Nə işi var soltan ilə, xan ilə.* M.V.Vidadi. *Dindar camaatı hələ başa salmaq olmur ki, şahsız və soltansız məmləkət şura üsulu ilə idarə oluna bilər.* M.İbrahimov.

**SOLUB-SARALMA** "Solub-saralmaq"dan *f.is.*

**SOLUB-SARALMAQ** *f.* Solmaq, saralmaq; rəngini, parlaqlığını, təravətini itirmək; bozarmaq. *Burada sınıq budaqlı ağaclar susuz qalıb qurumağa başlamış, bağçalar solub-saralmış*(*dı*).. Ə.Məmmədxanlı.

**SOLUXMA** "Soluxmaq"dan *f.is.*

**SOLUXMAQ** *f.* Solmaq. [Dostumun] *rast və gözəl qaməti əyilib, rəngi soluxub, gözlərinin işığı gedib.* F.Köçərli. *Gün batdı, ağardı hər cığır, hər iz; Amma soluxmadı dağ başında nur.* N.Xəzri.

**SOLUQ** *sif.* Solmuş, solğun, rəngi qaçmış, təravəti qaçmış. [Qurbanın] *biixtiyar soluq dodaqlarından bütün iztirab və kədərlərinə tərcüman olan bir* "*of*" *uçdu.* A.Şaiq. *Ömür qəndilinin şölələrindən; Dərdiyi çiçəklər olacaq soluq.* M.Müşfiq.

**SOLYARİ** *is.* [*lat.*] Günəş vannası qəbul edənlər üçün avadanlığı olan yer.

**SOLYARKA** *is.* [*rus.*] Neft yanacağının bir növü.

**SOMATOLOGİYA** *is.* [*yun.*] *tibb.* İnsan bədəninin ölçülərini və tənasübünü öyrənən elm sahəsi.

**SOMBRÉRO** *is.* [*isp.*] Kənarları enli şlyapa.

**SON** *is.* 1. Bir şeyin qurtaracağı, nəhayəti, axırı; axır. *Yolun sonu. Küçənin sonu.* – *Bayramın Məşədibəygilə qonaq gəldiyi ilk gün son gün olmadı.* M.Hüseyn. *Əhmədov Əzizi ancaq işin sonunu xəbər verən zəng çalınanda buraxdı.* S.Rəhman.

2. Eyni mənada zaman haqqında. *İlin sonu. Ayın sonunda. İş gününün sonu.* // Bir işin bitməsi, qurtarması, başa çatması. *İşi sona çatır. Hadisənin sonunu gözləmək.* // *sif.* Axırıncı, sonuncu. *Yayın son ayı. Son cərgədə oturmaq.* – [Nuriyyə:] *Son kursda oxuyan Ayna adlı bakılı bir qızla dost olmuşuq.* İ.Əfəndiyev.

3. Aqibət, nəticə, axır. *Kambayev dəhşətli sonun yaxınlaşdığını görürdü.* S.Rəhman.

4. *məc.* Ölüm, ölmə, son nəfəs. *Sonu gəlib çatmışdır. Onun sonudur. Son nəfəsə kimi.*

5. Ən yeni, ən təzə, yenicə meydana çıxmış, axırıncı. *Son moda. Elmin son nailiyyətləri. Son xəbərlər.* – *Patefonda son dəbli bir oyun havası çalınır.* İ.Əfəndiyev.

◊ **Son dərəcə** – olduqca çox, lap çox. *Son dərəcə gözəl. Son dərəcə çalışqan. Son dərəcə arıq.* – [Fatma arvad] *qonağının, bəlkə də gələcək gəlininin gəlişinə son dərəcə şad idi.* Mir Cəlal. *Leyla təəccübləndi: – Son dərəcə həssas oğlandır, – deyə, ürəyindən keçirdi.* B.Bayramov. **Son qoymaq (vermək)** – nəhayət vermək, daha etməmək, yol verməmək, əl çəkmək, dayandırmaq. [Fərəc Qurbana:] *Məsuliyyətsiz danışıqlara son qoymaq lazımdır.* Ə.Məmmədxanlı. *Cahandar ağa keçirdiyi iztirabların gözlərindən oxuna biləcəyini başa düşüb, nəzərlərini Əşrəfin üzündən yayındırdı və ani şaşqınlığa son qoyub, özünü toxtatdı.* İ.Şıxlı. **Son nəfəs** – axır nəfəs, həyatının son dəqiqələri. *Rzaquluxan isə son nəfəsdə ağlayırdı, həm də gülürdü. Zira doktorun sözlərinin təsəllidən ötrü olduğunu anlamışdı.* M.S.Ordubadi. *Son nəfəsdə qışqırırıq; Hava çatmır, hava çatmır.* B.Vahabzadə. **Sona yetirmək (çatdırmaq)** – bitirmək, qurtarmaq, tamamlamaq, axıra çatdırmaq. *Bütün gecəni yatmamış Firiduna elə gəldi ki, qorxunc və əzablı bir yuxu sona yetir.* M.İbrahimov. *Sanki bu nöqtədə çatırdı sona; Onun şıltaqları, onun nazları.* B.Vahabzadə. **Sonuna çıxmaq** – bax **axırına çıxmaq** ("**axır**"da). *O səni yumruqla torpağa yıxdı; Bütün duyğuların sonuna çıxdı..* M.Müşfiq.

**SONA** *is.* Əsil mənası ördək olub, gözəlliyinə görə aşıq şerində gözəlin epitetlərindən biri kimi (çox vaxt yaşılbaş sona tərkibində) işlənir. *Gecə-gündüz oda düşüb yanaram; Siyah telli bir sonanın ucundan.* M.V.Vidadi. *Könül, əbəs yerə üzmə canını; Sonaların əhdə olmaz vəfası.* Q.Zakir.

**SONALAMA** "Sonalamaq"dan *f.is.*

**SONALAMAQ** *f.* Hər şeyə irad tutmağa çalışmaq, hər şeydə nöqsan axtarmaq. *Əfruz bacı hər şeyi sonalayan idi. O, evin qabağında Kosanı qarşılayıb bala baxdı və qızışdı.* S.Rəhimov. *Öz evlərində heç bir şeyi sonalamayan, anası gətirən hər xörəyi yeyən Qədir qonaq getdiyi yerdə mərəkə açardı.* Mir Cəlal.

**SONÁTA** [*ital.*] Xarakter və tempi etibarilə adətən üç və ya dörd hissədən ibarət instrumental musiqi əsəri.

**SONATÍNA** [*ital.*] *mus.* Kiçik sonata.

**SONBEŞİK** *is.* Sonuncu, axırıncı uşaq, övlad. *Ailənin sonbeşiyi. – Tükəzban ilk və sonbeşiyi olan Qüdrəti min əziyyətlə boya-başa çatdırdığından onun üstündə, öz təbirincə, nanə yarpağı kimi əsirdi.* M.Hüseyn. *Ulduz ailədə sonbeşik idi.* Ə.Məmmədxanlı.

**SONCUQ** *is.* Təpik, şıllaq. □ **Soncuq atmaq** – bax **soncuqlamaq**. *Öküz soncuq atır.* // Tərslik eləmək, deyilənə qulaq asmamaq. *Gülsənəm arvad oğlunun sözlərindən bir az da əsəbiləşdi: – Eh, qurbanın olum, – dedi, – sevir sevsin, mən demirəm ki, onlar da düşmən olsun, amma sevməyin də bir təhəri var axı. Daha bundan ötrü niyə soncuq atır?* M.Hüseyn.

**SONCUQLAMA** "Soncuqlamaq"dan *f.is.* *Köçün yaraşığı dananın soncuqlamasıdır.* (Ata. sözü).

**SONCUQLAMAQ** *f.* Soncuq atmaq, təpik atmaq, şıllaq atmaq. *Cöngə isə hey soncuqlayır, təkə kimi atılıb-düşürdü.* S.Rəhimov.

**SONÉT** *is.* [*fr.*] Şeir janrı.

**SONLUQ** *is. qram.* Sözün qrammatik dəyişən son hissəsi. *Hal sonluqları.*

**SONOR** *is.* [*lat.*] Səs tellərinin ahəngdar hərəkəti ilə yaranan samit səs.

**SONRA** 1. *zərf* Bir işin, hadisənin baş verməsində zaman ardıcıllığı göstərən zaman zərfi. *Əvvəlcə müəllim, sonra uşaqlar danışdı. – Qonaq əvvəlcə Bayramla, sonra da Məşədibəylə vidalaşıb çıxdı.* M.Hüseyn. *On beş gün sonra aparılan işlərin ilk nəticəsi yoxlandı.* H.Seyidbəyli.

2. *qoş.* Arxasınca, ardınca, dalınca. *Məndən sonra kimdir? Hamıdan sonra gəlmək. Saat 2-dən sonra. Yağışdan sonra gün çıxdı. – Uşaqlar dağılışdılar və xanım da ancaq bundan sonra eyvandan otağa çəkildi.* P.Makulu. □ **Bir azdan (qədərdən) sonra** – azacıq sonra, az, aradan çox keçməmiş. *Bir qədərdən sonra qapı açılır.* Ü.Hacıbəyov. *Bir azdan sonra dəmirçi Musa gəlib çıxdı.* M.Hüseyn. **Bundan sonra** – bundan belə, bir də, daha, artıq. *Bundan sonra belə işlər etmə. Bundan sonra gözümə görünmə.* // Yoxsa, əks təqdirdə. *Ora getmə, sonra özün peşman olarsan.*

3. Bir də, ondan başqa, yenə, habelə. *Sonra, canım sənə desin...*

**SONRADAN** *zərf* Sonra, axırda, nəhayətdə, nəticədə, aqibətdə; bir müddət, bir az keçəndən sonra. *Məsələni sonradan başa düşdü. Sonradan peşman olmaq. Sonradan ağlına gəlmək.* – [Kərəm:] *Səgrəqibin fitnəsinə inandım; Firqət nə olduğun sonradan qandım.* "Əsli və Kərəm". *Həqiqət halda Sitarə barəsində* [Məmmədbağırın] *belə, sonradan boşamaq fikri yoxdu.* S.Hüseyn.

**SONRADAN-SONRAYA** *zərf* Axırda, bir az keçəndən sonra, bir qədər fikirləşəndən sonra. *İsmayıl kişi fikrə getdi. Sonradan-sonraya dedi: – Silahlarını ələ gətirə bilsək, daha yaxşı olar.* P.Makulu.

**SONRAKI** *zərf* 1. Sonra olan, sonra baş verən, bir şeyin ardınca gələn. *Sonrakı hadisə. Sonrakı fikir. Sonrakı nəticələr. Sonrakı peşmançılıq fayda verməz.*

2. Gələcək, qarşıdakı, növbədəki. *Sonrakı işləri fikirləşmək. – Sonrakı illər Nadirlə Züleyxanı bir-birinə daha möhkəm bağladı.* H.Seyidbəyli.

**SONRALAR(I)** *zərf* Bir hadisədən, əhvalatdan, işdən sonrakı vaxt, sonrakı vaxtlar(da). *Əvvəl yaxşı idi, sonraları əhvalı pozuldu. – Bu əhvalatı mənə sonralar anam danışmışdı.* M.Rzaquluzadə. *Qəzənfər sonralar Dürrənin ailəsinə böyük yardım göstərdi.* S.Vəliyev. *Əvvəllər kənd uşaqları "xan cığal olar" – deyə,* [Məmmədxanla] *oynamaq istəməsələr də, sonralar razılıq vermişdilər.* P.Makulu.

**SONRALIQ** 1. B a x **sonradan**. *Bu kağızın məzmunundan və 2000 manat puldan hamısı şad olub, sonralıq xoşbəxt və şadlıq ilə yaşadılar.* B.Talıblı.

2. *sif.* Sonra görülməli olan, görüləcək; sonrakı vaxtı nəzərdə tutan. *Bu, sonralıq işdir.*

**SONRALIQCA** *zərf* Sonradan, sonra. *Sonralıqca hamı gəldi. – Bəs bu yazıq Tükəzbana niyə erkək deyirlər, əlbəttə, sonralıqca hamımız biləcəyik.* B.Talıblı.

**SONRASI** *zərf* Axırı, ardı, nəticəsi, aqibəti. *Sonrası bəlli olar. Sonrasına baxarıq.*

**SONSUZ[1]** *sif.* Sonu, nəhayəti, axırı olmayan; hədsiz, bitməz-tükənməz. *Sonsuz qayğı. Sonsuz boşluq. Sonsuz bir maraq. Sonsuz məhəbbət. – Bu bəxtiyar üzlərdə nə nadir yaraşıq var! Sonsuz sevinc doğurur işıqların yanması.* R.Rza. *Sən açdın beləcə son səhərini; Son səhər bir sonsuz gecəyə döndü.* N.Xəzri.

**SONSUZ[2]** *sif.* Uşağı, övladı olmayan. *Sonra Tutu xala, mənim bu sonsuz mehriban xalam, ayağa qalxıb işığı yandırdı.* Ə.Məmmədxanlı. *Sonsuz, dul kişi* [Sultan Əmirli] *çox zaman evə baş salmaq belə istəməzdi.* İ.Hüseynov.

**SONSUZLUQ[1]** *is.* Sonu, nəhayəti olmama; nəhayətsizlik, intəhasızlıq. *Amma bu qısacıq məsafə Qulama sonsuzluq təsiri bağışladı.* Ə.Əbülhəsən.

**SONSUZLUQ[2]** *is.* Sonsuz olma, övladı, uşağı olmama. *Sadığın qardaşı da ağlamsındı, sonsuzluğun bütün ağırlığını duymuş adamlar kimi büzüşdü.* M.Hüseyn. [Məsumə Muxtara:] *Sənin kimi övladdansa, sonsuzluq yaxşıdır.* B.Bayramov.

**SONUC** b a x **son** 3-cü mənada.

**SONUNCU** *sif.* Ən axırıncı, axırdakı, axırda olan. *Sonuncu dərs. Sonuncu tamaşa. – Qoca kişi sonuncu daşı da yonub hazır etmişdi.* S.Rəhimov.

**SOPLO** *is. tex.* Ucluq.

**SOPRÁNO** [*ital.*] *mus.* 1. Ən yüksək qadın səsi.

2. Belə səsi olan müğənni haqqında.

**SORAQ** *is.* Axtarma, arama, soruşma, soruşub bilmə (öyrənmə, xəbər tutma); soruşmaqla öyrənilən şey, xəbər, məlumat. *Xucuklu Mahmudbəy çoxdandı ki, Nəbinin sorağında idi.* "Qaçaq Nəbi". // Biri haqqında məlumat, xəbər. [Ümid nazirə:] *Bəs sizin sorağınız "Nərimanov" kolxozundan gəlir.* B.Bayramov. ◻ **Sorağında olmaq** – həsrətində olmaq, axtarmaq, təmənnasında olmaq. *Vaqif durnalardan təmənna eləyir ki, intizarını çəkdiyi və sorağında olduğu alagözlü həmdəmdən görsünlər ona bir xəbər və əsər gətirə bilərlərmi?* F.Köçərli. **Soraq almaq** – bir xəbər bilmək, məlumatı olmaq. *Sorağını aldım.* – [Əlyar xan] *harada nadir, gözəl, diqqətəlayiq bir şeyin sorağını alardısa, hər necə vasitə ilə olursa olsun, dərhal onu ələ keçirməyə çalışardı.* Ə.Məmmədxanlı. **Soraq etmək** – axtarmaq, aramaq, ondan-bundan soruşub öyrənmək, bilmək, xəbər tutmaq, məlumat almaq. – *İnəyi itən soraq edər.* (Ata. sözü). *Haraları gəzib aramalı, kimi soraq etməli idim.* S.Hüseyn. [Şahin:] [Müəllimimiz] *fikirləşib ki, saatın itdiyini tələbələrdən*

*soraq eləsəm yaxşı düşməz*. B.Bayramov. **Soraq vermək** – xəbər vermək, məlumat vermək. *Gələcək günlərdən verərək soraq; Oldu bir-birinə ürəklər dayaq*. S.Rüstəm. [Katibədən] *heç kəs bir soraq verməyirdi*. Ə.Əbülhəsən.

**SORAQÇI** *is.* Soraq edən, soruşan, axtaran. *Soraqçının tüstüsü dabanından çıxar*. (Məsəl).

**SORAQLAMA, SORAQLAŞMA** "Soraqlamaq" və "soraqlaşmaq"dan *f.is.*

**SORAQLAMAQ, SORAQLAŞMAQ** *f.* Soruşmaq, soraq etmək, ondan-bundan soruşaraq bilmək. *Yar dağdan aşdı, getdi; Ürəyi daşdı, getdi; Axtardım, soraqladım; Dedilər, qaçdı getdi*. (Bayatı). [Əhməd:] *Qoyaram yolunda şirin canımı; Soraqlaşıb Qəribini taparam*. "Aşıq Qərib". *O, uzun müddət axtardıqdan, soraqlaşdıqdan sonra Gövhərin yerini öyrənmişdi.* Ə.Vəliyev.

**SORAQSIZ** *sif.* və *zərf* Xəbərsiz, xəbər vermədən, xəbərdarlıq etmədən. *Soraqsız itmək. Soraqsız gəlmək*. – [Mədinə Yavərə:] *Bilmirəm səndə nə adətdir, soraqsız, xətərsiz adamın başının üstünü alırsan*. M.İbrahimov.

**SORAQ-SORAQLA** *zərf* Soruşa-soruşa, soruşub xəbər tutmaqla, axtara-axtara. *Soraq-soraqla istədiyini taparsan. – Doğrudur, deyərlər ki, soraq-soraqla həccə getmək olar.* M.Rzaquluzadə.

**SORĞU, SORĞU-SUAL** *is.* Sual, sual etmə, verilən sual. *Sorğuya qısa cavab vermək. – Ağsaçlı, ağbığlı, ağsaqqallı, ancaq lalə kimi qırmızıyanaqlı Əmiraslan baba nəvəsinin sorğularına cavab verirdi*. S.Rəhimov. [Azad:] *Qoy xəbər verim, yoxsa sorğu-sualdan yaxamızı qurtara bilməyəcəyik*. S.Rəhman. *Səfiyyə sorğu-sualı uzatmamaq üçün tələsik ünvanı, hətta evin nömrəsini də deyib getməyə icazə istədi*. H.Seyidbəyli. // Dindirmə, suallar vermə, soruşma, istintaq. ☐ **Sorğu (sorğu-sual) etmək** – soruşmaq, sual vermək. [Çiyələk] *sorğu-sual eləmədi, lakin mahiyyətinə də enmədi.* B.Bayramov. **Sorğu-suala tutmaq** – dalbadal sual vermək, çox dindirmək, soruşmaq. [Malik] *məsələni anlamaq üçün kim gəldi, sorğu-suala tuturdu*. M.İbrahimov. [Həkim:] [Ataşı] *bu saat sorğu-suala tutmaq olmaz*. Ə.Vəliyev.

**SORMA¹** "Sormaq¹"dan *f.is.*

**SORMA²** "Sormaq²"dan *f.is.*

**SORMAQ¹** *f.* Soruşmaq, sual etmək, xəbər almaq. *Gər sual eyləsə zahid, ki nədir nəşeyimey? Degilən, get onu meyxanədə sağərdən sor*. S.Ə.Şirvani. *Bahadır papiros yandırıb Sultandan sordu..* N.Nərimanov. *Əhməd hekayəsini tamam etdi. İkimiz də bir-birimizin üzünə baxırdıq. Əhməd gözləyirdi ki, mən bir şey soracağam*. T.Ş.Simurq.

**SORMAQ²** *f.* 1. Əmmək. *Boynum qolunu dilər həvadan; Ləlim ləbini sorar səbadan*. Füzuli. *Uşaq iydən ürkən kimi olub başını buladı, lakin yenə də döşü tapıb sordu*. M.İbrahimov.

2. Dil və dodaqların hərəkətilə konfet, qənd və bu kimi şeyləri ağzında yavaş-yavaş əridərək yemək. *Monpası sormaq. Nabat sormaq*. – [Mustafa] *haradansa tapdığı çay daşını durmadan sorurdu*. S.Vəliyev.

3. B a x **sovurmaq**. *Dağ üstə boran gəlir; Qarları soran gəlir. Atın dördnala çapır; Arxamda duran gəlir*. (Bayatı).

◊ **Qanını (şirəsini) sormaq** – b a x **qanını sormaq** ("**qan**"da). *..Mir Yəhya ağalar avam qardaşlarımızın canına daraşıb .. qanlarını sorurlar.* C.Məmmədquluzadə. *Nə qədər ki,* [mülkədarlar] *yaşayırlar, sizin şirənizi soracaqlar*. Ə.Vəliyev.

**SORT** [*fr.* sorte, əsli *lat.*] 1. Hər hansı bir malın keyfiyyət və qiymət cəhətdən dərəcəsi, növü, çeşidi. *Çayın sortu. Tütünün sortu. Birinci sort un*. – [Xəlil:] *Pambığı tez yığanda ikinci sortla təhvil verirlər.* M.Hüseyn.

2. Hər hansı bir mədəni bitkinin təsərrüfat üçün daha qiymətli xüsusiyyətlərə malik olan növü. *Buğdanın quraqlığa davamlı sortu. Şərablıq üzüm sortları. Tezyetişən alma sortları.*

**SORTÁMENT** *is.* [*fr.*] Eyni cinsli məmulat və materialların sort, növ, tip və ölçü cəhətdən çeşidi.

**SORTLAMA** "Sortlamaq"dan *f.is.*

**SORTLAMAQ** b a x **sortlaşdırmaq**.

**SORTLAŞDIRMA** "Sortlaşdırmaq"dan *f.is.*

**SORTLAŞDIRMAQ** *f.* Sortlara ayırmaq, növlərə ayırmaq; çeşidləmək.

**SORTLAYICI** *is.* Bir şeyi sortlara, növlərə, çeşidlərə ayıran işçi (maşın).

**SORTLUQ** *is.* Müəyyən sorta (2-ci mənada) aid olma; cins. *Sortluq toxum.*

**SORTSINAMA** *is. k.t.* Toxumların sortunu (növünü, cinsini, keyfiyyətini) yoxlayıb qiymətləndirmə.

**SORUCU**[1] *sif.* Soran, sorub çəkən. *Bitkinin sorucu rişələri. Sorucu həşərat. Sorucu orqan.* // Sormağa, sorub çəkməyə məxsus. *Sorucu klapan. Sorucu nasos.*

**SORUCU**[2] *is.* Sual edən, soruşan, sualedici, sual ifadə edən. *Sorucu baxış. – Qız tanımadığı bu adamları utancaq və sorucu nəzərlərlə seyr edirdi.* Ə.Sadıq.

**SORUŞMA** "Soruşmaq"dan *f.is.*

**SORUŞMAQ** *f.* 1. Bir şeyi bilmək, bir şey haqqında məlumat almaq üçün birinə sualla müraciət etmək; sual etmək. *Xəstənin halını soruşmaq. Dərslərini soruşmaq. Yaşını soruşmaq. – Kimin ixtiyarı var idi, soruşsun haradan* [Xudayar bəyə] *bəylik yetişib.* C.Məmmədquluzadə. *Bəli, mənim qürurum; Gəl, soruşma nədəndir; Çağlayan Xəzərimi; Bu cür sevdiyimdəndir.* N.Xəzri. // Fikrini bilmək istəmək, icazə istəmək. *Soruş, sonra get.*

2. Birini görmək, birilə görüşmək arzusunda olduğunu bildirmək. *Kimsə sizi soruşurdu. Müdir səni soruşurdu.*

3. Üzərinə məsuliyyət düşmək, bir şey haqqında qaneedici cavab tələb etmək. *Bu işi səndən soruşacaqlar.*

**SORUŞULMA** "Soruşulmaq"dan *f.is.*

**SORUŞULMAQ** *məch.* Sual edilmək. *Soruşula bilər ki, indi bundan sonra daha kim qaradama tövlə səkisindən qopub, pəncərəli bir otaqça tikib buraya çıxa bilərdi.* S.Rəhimov.

**SOSİÁL** [*lat.*] Mürəkkəb sözlərin sosialist mənasında olan birinci tərkib hissəsi; məs.: sosial-demokrat, sosial-demokratizm və s.

**SOSİÁL-DEMOKRÁT** Sosial-demokrat partiyasının üzvü, sosial-demokratiya tərəfdarı.

**SOSİÁL-DEMOKRATÍK** *sif.* Sosial-demokratiyaya aid. *Sosial-demokratik ideologiya. Sosial-demokratik görüşlər.*

**SOSİÁL-DEMOKRÁTİYA** XIX əsrin sonuncu rübündə meydana gələn sosialist partiyalarının ümumi adı. *Rusiya sosial-demokratiyası. Alman sosial-demokratiyası.*

**SOSİÁL-DEMOKRATÍZM** Sosial-demokratiyanın ideologiyası və taktikası.

**SOSİÁL-İMPERİALÍST** Sosial-imperializm siyasəti yeridən və ya bu siyasəti müdafiə edən adam.

**SOSİÁL-İMPERİALÍZM** Opportunizmin bir növü, sosial-demokratların öz ölkələrinin imperialist hökumətini dayaqlama siyasəti.

**SOSİALÍST** 1. Sosializm (2-ci mənada) tərəfdarı.

2. Sosialist partiyasının üzvü.

**SOSİALİSTLƏŞDİRMƏ** "Sosialistləşdirmək"dən *f.is.*

**SOSİALİSTLƏŞDİRMƏK** *f.* Bütün cəmiyyətin mülkiyyəti etmək, sosialist mülkiyyətinə çevirmək. *Ağır sənayeni sosialistləşdirmək.*

**SOSİALÍZM** [*lat.* sosialis – ictimai, müştərək] 1. Sosialist inqilabı, burjua hakimiyyətinin devrilməsi və proletar diktaturası yaradılması, istismarçı siniflərin ləğv edilməsi nəticəsində qurulan dövlət və ictimai quruluş – kommunizmin birinci fazası.

2. Sosializm cəmiyyəti qurulması haqqında nəzəriyyə. *Elmi sosializm.*

3. Bərabərçilik və ya antaqonist ziddiyyətləri yumşaltma əsasında kapitalist cəmiyyətini islah etmək haqqında müxtəlif xırda burjua və burjua nəzəriyyələrinin adı. *Xalqçı sosializmi. Xristian sosializmi.*

**SOSİÁL-REVOLYUSİONÉR** [ixtisarı: "eser"] 1902-ci ildə Rusiyada xalqçı qrupları qalıqlarından əmələ gəlib, Oktyabr inqilabından sonra sovet hakimiyyətinə qarşı mübarizə aparmış əksinqilabçı qolçomaq partiyasının üzvü.

**SOSİOLÓGİYA** [*lat.* societas – cəmiyyət və *yun.* logia – təlim] Cəmiyyət inkişafının ümumi qanunları haqqında elm.

**SOSİOLOJÍ** *sif.* [*lat.*] Sosiologiyaya aid. *Sosioloji qanun. Sosioloji nəzəriyyə.*

**SOSİÓLOQ** [*lat.* societas – cəmiyyət və *yun.* logos – məfhum, təlim] *Sosiologiya mütəxəssisi.*

**SOSÍSKA** [*rus.*] Bişmiş halda yeyilən nazik kolbasa. [Vəlibəy:] *Canım, Allahın kələm suyu borşu istəyirsən, içindən sosiska çıxır.* S.S.Axundov.

**SOSİSKAXANA** *is.* Sosiska bişirilib satılan qəlyanaltı dükanı.

**SOSYARIŞ** *is.* "Sosializm yarışı" qısaltma forması.

**SÓUS** [*fr.* sauce] Xörək şirəsi.

**SOUSLU** *sif.* Sousu olan, sousla bişirilmiş.

**SOVÉT**[1] *is.* [*rus.*] Müəyyən sahəyə aid mütəxəssislər qrupu; şura. *Elmi sovet. Muharibə veteranları şurası.*

**SOVÉT**[2] *is.* [*rus.*] 1. *köhn.* Rusiyada sosializm cəmiyyətinin siyasi təşkilat forması. *SSRİ Ali Soveti.*

2. *köhn.* Müxtəlif kollegial orqanların adı. *Nazirlər Soveti.*

**SOVETLƏŞDİRİLMƏ** "Sovetləşdirilmək"dən *f.is.*

**SOVETLƏŞDİRİLMƏK** *məch.* Sovet hakimiyyəti qurulmaq, Sovet hakimiyyəti orqanları yaradılmaq.

**SOVETLƏŞDİRMƏ** "Sovetləşdirmək"dən *f.is.*

**SOVETLƏŞDİRMƏK** *f.* Bir yerdə Sovet hakimiyyəti, Sovet hakimiyyəti orqanları qurmaq, yaratmaq.

**SOVETLƏŞMƏ** "Sovetləşmək"dən *f.is.*

**SOVETLƏŞMƏK** *f.* Sovet qaydasınca qurulmaq, sovet xarakteri almaq.

**SOVXA** *is.* Ölən adamın qalmış şeyləri. [Hacı Qara:] *Heç kəs malın üzünə baxmır. Deyəsən, ölətdən qırılanların sovxasıdır.* M.F.Axundzadə. ◻ **Sovxaya qalsın, sovxaya qalmış!** – qarğış, nifrin mənasında. [Mürsəl:] *Görüm ki, canını dərd, azar alsın; Süpürgə bığların sovxaya qalsın.* S.Rüstəm. [Nisə xanım:] *Sovxaya qalmış eynəyi tapa bilmirəm!..* Ə.Məmmədxanlı. // Söyüş yerində işlənir.

**SOVXÓZ** [*rus.* "советское хозяйство" söz. ixtisarı] Dövlətə tabe olan kollektiv kənd təsərrüfatı; təsərrüfat birliyi. *Qoyunçuluq sovxozu. Taxılçılıq sovxozu. Sovxoz direktoru. Sovxoz təsərrüfatı. – Sovxoz fəhlələri əllərində böyük zənbillər plantasiyalara yayılmışdılar.* H.Seyidbəyli.

**Sov.İKP** – Sovet İttifaqı Kommunist Partiyası.

**SÓVKA** [*rus.*] *zool.* Tırtılları kənd təsərrüfatı bitkilərinə ziyan verən gecə kəpənəkləri qrupunun adı. *Kələm sovkası. – Alov burula-burula ətrafı qarsır, elə bil qəsdən çor və sovkanın artıb törəmək istədiyi yerləri yandırırdı.* Ə.Vəliyev.

**SOVQAT** *is.* Birinə göndərilən pay; hədiyyə, bəxşiş. [Vəzir:] *Bağışlayanda mən deyəcəyəm ki, bacım, Hidayət xanın arvadı bu nimtənəni Şölə xanıma sovqat göndəribdir.* M.F.Axundzadə. *Kəblə Məmmədhüseynin kirvə oğlu "Qurdbasar" kəndindən bura bir quzu sovqat göndərmişdi.* C.Məmmədquluzadə. *Anam heybəni sovqatla doldurur, atam qoşulu araba yanında məni gözləyirdi.* Ə.Məmmədxanlı.

**SOVMAQ** *f.* Kənar eləmək, başdan eləmək.

**SOVMƏƏ** *is.* [*ər.*] İbadətxana, ibadətgah, hücrə. [Mirzə] *əlləşib bu daşların arasında özünə bir sovməə tikdi.* S.Rəhimov. *Tağların bir başqasında balaca sovməələr olardı, bunlara da xəlvəti deyərdilər.* H.Sarabski.

**SOVURMA** "Sovurmaq"dan *f.is.*

**SOVURMAQ** *f.* 1. Havaya atmaq, sovurucu maşın vasitəsilə dəni samandan, zibildən təmizləmək. *Bir azdan Dəmirov şana ilə taxılı sovurmağa başladı.* S.Rəhimov. *..Döyülən taxılı sovururdular.* Ə.Əbülhəsən.

2. Havaya qaldırmaq, səpələmək, dağıtmaq. *Hərdən külək qalxır, yerdən qarı qapıya sovurur; Gəlib-gedən insanların üz-gözünü qovurur.* A.Səhhət. *Biz şəhərə girdiyimiz zaman şiddətli xəzri əsir, küçələrin tozunu havaya sovurur, göydən başımıza torpaq yağırdı.* A.Şaiq.

3. *məc.* Hədər yerə, boş-boşuna xərcləmək, puç etmək; israfçılıq etmək.

4. *məc.* Yağdırmaq, demək. [Qorxmaz Dönməzə:] *Bir gün böyük bir izdihamın səni söyərək, lənətlər sovuraraq, səni daşladığını gördüm.* C.Cabbarlı. [Rauf:] *Evi* [vaxtında] *boşaltmadığı üçün biçarəni alçaqcasına təhqir etmiş, ağzına gələni sovurmuş.* H.Cavid.

◊ **Yelə sovurmaq** – heç eləmək, puça çıxartmaq. [Atabala:] *..Çox müstəbidin ocağını söndürüb yelə sovurmuşdu.* A.Şaiq. **Külünü göyə (ərşə) sovurmaq** – b a x **sovurmaq**. [Nizami:] *Mən Əxi Fərruxun fikirləri üzərində böyük və qiymətli əsərlər yazmışdım, lakin onları sizin kürəkəniniz Atabəy Məhəmməd*

*məhv etdirdi, onların külünü göyə sovurdu.* M.S.Ordubadi.

**SOVURUCU** *is. k.t.* Taxılsovuran maşın, alət. // Sif. mənasında. *Sovurucu maşın.*

**SOVURUQ** 1. Bax **burulğan** 2-ci mənada. *Qar sovuruğu. Çovğun sovuruğu.*

2. Taxılı təmizləmək üçün havaya atma. *Firidun sovuruq ata-ata, Musa kişinin günəşdən tunc kimi qaralmış üzünə baxdı və heç bir söz demədi.* M.İbrahimov.

**SOVUŞMA** "Sovuşmaq"dan *f.is.*

**SOVUŞMAQ** *f.* 1. Getmək, keçmək, uzaqlaşmaq, çəkilmək (nəzərə çarpmadan). *Arabir səkilərlə keçənlər mühüm bir işi olan adamlar kimi küçələrdən tez sovuşub gedirdi.* A.Şaiq. *Rüxsara bir şey edir kimi, çiyinləri üstündən geriyə baxdı, gödək tumanlı bir qaraltı sağdan sovuşub yuxarıya ötdü.* S.Rəhimov. // Əkilmək, sivişmək, yayınmaq, xəlvəti qaçmaq. *Balaca Sabir günorta yeməyini yeyib sovuşdu.* S.Rəhimov.

2. Ötmək, keçmək; keçib getmək, ötüb keçmək. [Axund:] *Hərçənd ki, az qalmışdı aralıqda güllə mənə dəysin, amma şükür Allaha ki, xata yandan sovuşdu.* B.Talıblı. [İlyas Adiləyə:] *Beləliklə, ilk fəlakət sovuşdu, yoxsa hər ikimiz uçuruma aşıb məhv olacaqdıq.* Ə.Məmmədxanlı. // Eyni zamanda vaxt, zaman, mövsüm haqqında. *Həftə sovuşdu, getdi; Ay gəldi, başa çatdı.* R.Rza.

3. Dayanmaq, ara vermək, kəsmək, keçmək, ötmək. *Qoy yağış sovuşsun, sonra söylə!* Ə.Vəliyev.

4. *məc.* Yaddan çıxmaq, unudulmaq; yox olmaq, keçib getmək. *Amma o duyğu tez sovuşdu məndən; Vallah, gərək başın düşsün bədəndən.* A.Səhhət. [Bəhram:] *Bəhram, qorx! Qorx öz vicdanından! Sən ki Saranın xatiri üçün bu işə iqdam etmişdin, nə tez sovuşdun!* C.Cabbarlı. *Pirinin dilxorluğu bir anda sovuşdu.* İ.Əfəndiyev.

**SOY** *is.* Əsil, əcdad, əsil-nəsəb, mənşə, cins.

**SOYA** *is.* [*yapon.*] Paxla fəsiləsindən birillik bitki.

**SOYAD** *is.* Şəxsi addan başqa nəslən verilən ad; familiya.

**SOYDAŞ** *is.* Bir soydan, bir nəsildən, bir kökdən olan adamlardan hər biri.

**SOYĞUN** *is.* Soyma, talama, talan, çapqın. *Şəhərdə böyük soyğun oldu.*

**SOYĞUNÇU** *is.* Soyğunçuluqla, qarətlə məşğul olan adam; çapovulçu, qarətgər, adamsoyan; quldur. *Bakı yanğınların, barıt tüstülərinin, quldurların və soyğunçuların ixtiyarına verilmişdi.* M.S.Ordubadi. *Dağlar arasından keçdikcə, hər addımda oğru soyğunçu gözlənilirdi.* Mir Cəlal.

**SOYĞUNÇULUQ** *is.* Talançılıq, çapqınçılıq, quldurluq, qarətgərlik. *Gülpərini qorxuya salan dağlar arasından və meşələr içindən keçən yollardı ki, oralarda çox vaxtı soyğunçuluq ittifaq düşərdi.* S.S.Axundov. [Həsən] *..keçmiş ağaların zülm və soyğunçuluğunun şahidi olmuşdu.* M.İbrahimov.

**SOYMA** "Soymaq"dan *f.is.*

**SOYMAQ** *f.* 1. Hər hansı bir şeyin üst qabığını, dərisini çıxartmaq, yapışdığı yerdən qoparmaq, aralayıb götürmək. *Alma soymaq. – İt yetib, arvadın əllərinin dərisini tamam dişləri ilə soyub tökdü.* Çəmənzəminli. *Arvad soyduğu kartofu bir yana qoyub təəccüblə Qəribova yaxınlaşdı.* S.Rəhman. // Kəsilmiş heyvanın dərisini çıxartmaq. *Qoyun soymaq. – Aşpazlar erkəkləri soyub dərilərini çevirməkdə idilər.* Ə.Vəliyev.

2. *məc.* Bütün var-yoxunu əlindən almaq; çapmaq, talamaq. [Murov Hacı Qaraya:] *Bəs sən Əylis ermənilərini soyub, ipəklərini aparanların yoldaşı deyilsən?* M.F.Axundzadə.

◊ **Dərisini soymaq** – bax **dəri**. [Mirzə Hüseyn Nərimana:] *Hacı Bayram kimi qan içənə, camaatın dərisini soyana nökərçilik edincə öz işinə qulluq edərsən.* Ə.Haqverdiyev. **Soyub soğana döndərmək** – bax **soğan kimi (qabığını) soymaq**. [Böyük oğul:] *Hakimlərdə o təqsir var ki, əlinə azarlı keçəndə soyub soğana döndərirlər.* Qantəmir.

**SOYSUZ** *sif.* Soyu, əsli olmayan, ya məlum olmayan.

**SOYUDUCU** *is.* 1. Bir şeyi soyutmaq üçün aparat, cihaz. *Neft emalı zavodlarında .. maye halında olan məhsulları soyudan aparatlara isə soyuducular deyilir.* M.Məmmədli. // Bir şeyi soyutmağa məxsus maddə və s.

2. Tez xarab olan məhsulları mühafizə etmək, soyutmaq üçün daxilində süni surətdə aşağı temperatur yaradılan cihaz, qurğu, otaq

və s. [Səriyyə:] [Evimdə] *televizor, soyuducu, paltaryuyan maşın, tozsoran vardı.* İ.Əfəndiyev. *Bibixanım Fərruxun işarəsi ilə soyuducudan içki çıxartdı.* B.Bayramov.

**SOYUDULMA** "Soyudulmaq"dan *f.is.*

**SOYUDULMAQ** *məch.* Soyuq hala gətirilmək, hərarəti azaldılmaq.

**SOYUĞADAVAMLI** *sif.* Soyuqdan, şaxtadan qorxmayan, soyuğa, şaxtaya davam gətirən. *Soyuğa davamlı bitkilər. Soyuğadavamlı materiallar.*

**SOYUĞADAVAMLILIQ** *is.* Soyuğadavamlı şeyin xassəsi. *Bitkilərin soyuğa davamlılığı.*

**SOYUQ** *sif.* 1. Hərarəti olmayan, temperaturu aşağı olan (hava və s. haqqında). *Soyuq külək. Soyuq hava. Soyuq qış. – Usta ortadakı soyuq su hovuzunun yanından keçib keçə ilə döşənmiş səkinin üstündə oturdu.* Çəmənzəminli. [Şofer:] *Bir yandan islanıb soyuqdan əsirəm, bir yandan da qorxudan məni soyuq tər basıb.* M.Rzaquluzadə. // *İs. mənasında.* Soyuq hava, şaxta. *Bu soyuqda hara gedəcəksən? Soyuqda oturmaq.* – [Kərbəlayı Qurban:] *Tez ol, qapını aç, soyuq məni kəsdi!* Çəmənzəminli. *Qadın ayaqyalın idi və belə məlum olurdu ki, soyuğu hiss etmir.* H.Seyidbəyli. // Cəm şəklində: **soyuqlar** – davamlı, sürəkli şaxtalar, soyuq hava. *İlk soyuqlar. Soyuqlar düşdü. Soyuqlar hələ də davam edir.* // Üşümə hissi, üşütmə. *Canıma soyuq düşdü.* □ **Soyuq aparmaq** – don vurmaq, şaxtadan (soyuqdan) donmaq. *Barmaqlarımı soyuq apardı.* **Soyuq dəymək (olmaq)** – soyuqlamaq, soyuqdan azarlamaq. [Sultan bəy:] *İndi üstüaçıq yatmışam, deyəsən, belimə soyuq dəyibdir.* Ü.Hacıbəyov. **Soyuq düşmək** – soyumaq (hava haqqında). *Axşam oldu, soyuq düşdü, dərələrdən duman qalxmağa başladı.* S.S.Axundov. *Dağlarda isə gözlənilmədən soyuq düşmüşdü.* M.Hüseyn.

2. Qızdırılmamış, qızdırılmayan, yaxud istini saxlamayan. *Soyuq otaq. Soyuq zal.* – [Nəbi] *qışda odsuz-ocaqsız, soyuq tövlədə buza dönmüş bədənini qızdırmaq üçün özünü günə verdi.* Ə.Abasov. // Bədəni soyuqdan qoruya bilməyən, soyuq keçən, istiliyi olmayan; nazik. *Soyuq paltar. Soyuq yorğan.* // Soyumuş, lazımınca isti olmayan. *Soyuq çay. Soyuq xörək. Soyuq samovar.* // Soyudulmuş halda hazırlanan və yeyilən. *Soyuq qəlyanaltı. Soyuq yeməklər.* // Şimali. *Soyuq ölkələr.*

3. *məc.* Sərt, riqqətsiz, etinasız. *Soyuq rəftar, münasibət. Soyuq cavab. Soyuq* (z.) *görüşmək. – Qız professora iti və soyuq* (z.) *bir nəzər salaraq heç bir cavab vermədi.* İ.Əfəndiyev. *Nərgiz Qorxmazı bir az soyuq* (z.) *qarşıladı.* Ə.Vəliyev. // *məc.* Coşğunluğu, ehtirası, hərarəti olmayan; ehtirassız, üzügülməz. *Soyuq qəlb. Soyuq adam. Soyuq baxış.*

4. *məc.* Darıxdırıcı, usandırıcı, ürəksıxan, cansıxıcı, maraqsız, süst. *Məclis çox soyuq* (z.) *keçdi. Məclisi soyuq* (z.) *görən Məryəm qayıdıb getdi.* B.Talıblı.

◊ **Soyuq müharibə** – imperialist dairələrin beynəlxalq münasibətlərdə gərginlik yaradan və yeni müharibə alışdırmağa doğru yönəldilən düşməncəsinə təcavüzkar siyasəti.

**SOYUQDƏYMƏ** *is.* Özünü soyuğa vermə; soyuqlama. [Şərəfoğlu Rüstəmə:] *Hərarətini ölçmək lazımdır, başağrısı soyuqdəymədən də ola bilər.* M.İbrahimov. [Nəcəfalı:] *Bir aydır ki, bircə gecə çimir eləməmişəm, indi soyuqdəymədən qorxub taxılı bada verə bilmərəm.* B.Bayramov.

**SOYUQQANLI** *sif.* və *zərf* 1. Hər cür şəraitdə özünü sakit, səbirli, təmkinli, dözümlü apara bilən. *Soyuqqanlı olmaq. – Çox mülayim və soyuqqanlı danışan İmran kişinin hər sözü* [Hümmətəlinin] *ortasından qılınc kimi keçirdi.* M.Hüseyn. *Bayraqcıqlarla tülkü və qurd ovuna çıxarkən, ovçu soyuqqanlı və cürətli, mahir iztapan olmalıdır.* M.Rzaquluzadə. [Qoşqar Əmirliyə:] *Düz bir ildir mən bu aparatda işləyirəm. Bir dəfə görməmişəm ki, mənimlə səbirlə, soyuqqanlı danışasınız.* İ.Hüseynov.

2. Qanısoyuq, xoşagəlməz, sevimsiz, ürəyəyatmaz. *Çox soyuqqanlı adamdır.*

**SOYUQQANLILIQ** *is.* 1. Soyuqqanlı adamın xasiyyəti; təmkinlilik, səbirlilik, təmkin. [Vaqif:] soyuqqanlılığını *saxlayaraq ricaya gələnlərin bir-ikisini içəri çağırdı.* Çəmənzəminli. [İslam:] "*Belə mühüm*" *işlərdə insan gərək soyuqqanlılığını əldən verməsin.* S.Hüseyn. *Nadir* [Məryəmin] *xasiyyətini və soyuqqanlılığını bilirdi.* B.Talıblı.

2. *məc.* Laqeydlik, biganəlik. // Qanısoyuqluq, xoşagəlməzlik, sevimsizlik, ürəyəyatmazlıq.

**SOYUQLAMA** "Soyuqlamaq"dan *f.is.*

**SOYUQLAMAQ** *f.* Soyuqdəymədən xəstələnmək, özünü soyuğa vermək. *Rüxsara xanım bir il bundan əvvəl soyuqlayıb naxoşlamışdı.* T.Ş.Simurq. [Ana:] *Bala, pəncərə qabağında çox oturursan, küləkdir, soyuqlayarsan!* Mir Cəlal.

**SOYUQLAŞMA** "Soyuqlaşmaq"dan *f.is.*

**SOYUQLAŞMAQ** *f.* Get-gedə soyuq olmaq (hava haqqında). *Avqust ayı aralığa gəldi, hava soyuqlaşdı.* N.Nərimanov. *Yavaş-yavaş havalar soyuqlaşdıqca bağ mövsümü başa çatardı.* H.Sarabski.

**SOYUQLUQ** *is.* 1. Soyuq şeyin halı, hərarət olmaması, hərarətsizlik; soyuq. *Havanın soyuqluğu. Suyun soyuqluğu. Küləyin soyuqluğu. – Havanın artar istisi; Daha soyuqluq az olar.* A.Səhhət. *Payızın rütubətli havaları başlanmış olduğundan soyuqluq hiss olunurdu.* T.Ş.Simurq. *Payızdır... havada soyuqluq da var; Onunçun yarpağı tökür indi o.* N.Xəzri.

2. *məc.* Əvvəlki məhəbbətin, hörmətin, yaxınlığın olmadığı hal, soyuq münasibət; sərinlik. *Aralarında soyuqluq var. – Bu səfər uşaqlar müəllimləri tərəfindən soyuqluq gördülər.* Çəmənzəminli. [Murad Nigarın] *rəftar və hərəkətlərində özünə qarşı bir soyuqluq hiss etdi.* S.Hüseyn. □ **Soyuqluq göstərmək** – soyuq münasibət göstərmək, soyuq qarşılamaq.

3. *məc.* Başısoyuqluq, səhlənkarlıq. □ **Soyuqluq eləmək** – öz işinə soyuq baxmaq, səhlənkarlıq, diqqətsizlik eləmək, fikir verməmək, laqeydlik göstərmək. [Qaragözov:] *Soyuqluq eləməyin, müalicəni yarımçıq qoymayın!* Mir Cəlal.

**SOYUQ-SOYUQ** *zərf* Soyuq halda, qızdırılmamış. *Xörəyi soyuq-soyuq yemək.*

**SOYULMA** "Soyulmaq"dan *f.is.*

**SOYULMAQ** *f.* 1. Qabığı, dərisi çıxarılmaq, kəsilib götürülmək.

2. *məc.* Var-yoxu, paltarı və üstündə nə varsa əlindən alınmaq, qarət edilmək. *Yenə kimin isə öldürüldüyünü, qız qaçırıldığını, ya adam soyulduğunu güman edirdilər.* Mir Cəlal. *Nə üçün sən soyulduğun haqda milis şöbəsinə xəbər vermədin?* H.Seyidbəyli.

**SOYUMA** "Soyumaq"dan *f.is. Zeynalın evdən soyumasına səbəb yalnız Mehribanın xəstə yatdığı deyildi.* S.Hüseyn.

**SOYUMAQ** *f.* 1. Soyuq olmaq, hərarətini itirmək, temperaturu aşağı düşmək. *Payız gəldi, havalar soyudu. – Hava da bərk soyumağa başlayırdı.* M.Hüseyn. *..Xəzəllər töküldü, toz qopdu, hava soyudu.* Mir Cəlal.

2. *məc.* Getdikcə həvəsdən düşmək, ruhdan düşmək. *İşdən soyumaq. – Elə mən özüm də bir həftə, bir ay; Yazmasam, şeirdən çox soyuyaram.* S.Vurğun. [Dəmirov] *işin qalmağından, adamların soyumağından ehtiyat edirdi.* S.Rəhimov.

3. *məc.* Getdikcə məhəbbətini, hissini itirmək, daha istəməmək. *Uşaqlardan soyumaq.* – [Sona xanım:] *Heydər, görünür ki, məndən soyumusan?* M.F.Axundzadə.

◊ **Acığı (hirsi) soyumaq** – b a x **acıq**. *Zalış Məşədi Qasımı döyməklə soyumayıb, tamam boğdu.* Çəmənzəminli. *Tükəzbanın hirsi bir az soyudu və qaşqabağı da bir az açıldı.* B.Talıblı.

**SOYUNDURMA** "Soyundurmaq"dan *f.is.*

**SOYUNDURMAQ** *f.* Paltarını çıxarmaq (başqasının). *Xədicə oğluna təsəlli verdi, sonra .. soyundurub yatağa uzandırdı.* S.S.Axundov.

**SOYUTMA** 1. "Soyutmaq"dan *f.is.*

2. *is.* Suda bişirilmiş ət, toyuq. *Soyutma hazırlamaq.* – [Səlim bəy:] *Qoyunlar axşamdan kəsilib, soyutma olub, cah-calal ilə, brovhabrov ilə düşürdük yola, guya bir qoşun gedir.* Ə.Haqverdiyev. [Katibə:] *Bu gün bufetdə soyutma* (sif.) *toyuq var. Gətirimmi?* M.Hüseyn.

**SOYUTMAQ** *f.* 1. Bir qədər soyuq eləmək, soyuq hala salmaq, soyumasına səbəb olmaq. *Pəncərəni açıb otağı soyutmaq. Xörəyi soyutmaq. – Nə qədər yel soyutsa da havanı; Çoban artıq büründü bərk çuxanı.* A.Səhhət. [Salman] *özünü havaya verib, tərini soyudurdu.* M.İbrahimov.

2. *məc.* Ruhdan salmaq, həvəsdən salmaq, uzaqlaşdırmaq, gözündən salmaq. *Sonra gündən-günə divanəsər etdin məni sən; Məktəbimdən soyudub dərbədər etdin məni sən.*

A.Səhhət. [Mirva] *dünən bu qızı xəstə kimi qələmə verməkdə Aslandan soyutmaq istəyirmiş.* S.Vəliyev.

◊ **Acığını (hirsini) soyutmaq** – acığını, hirsini yatırtmaq, sakitləşdirmək. *..Gülyaz qocanı dilə tutub yumşaltmaq, onun hirsini soyudub, öz istəkli qızını bu ağır xəstəlik yatağından qaldırmaq istəyirdi*. S.Rəhimov.

**SOZALMAQ** *f.* Rəngi ağarmaq, rəngi qaçmaq.

**SÖHBƏT** *is.* Şifahi fikir, məlumat mübadiləsi; danışıq, müsahibə, ixtilat. *Uzun-uzadı söhbət. – Əsas söhbətlər axşam şərbəti içilən zaman başlanacaq idi*. M.S.Ordubadi. *Tərbiyəçinin söhbətləri də gəzmək kimi ləzzətli idi.* Mir Cəlal. ☐ **Söhbət açmaq** – bir şəxs və ya şey haqqında danışmaq, fikir mübadiləsinə başlamaq. *O biri otaqda Yetər macal tapıb istədi söhbət açsın.* Çəmənzəminli. **Söhbət aparmaq** – fikir mübadiləsi etmək, müəyyən bir məsələ ətrafında müzakirə aparmaq, danışmaq, söhbət etmək. *Cavad öz döyüşçülərini ətrafına toplayaraq müxtəsər bir söhbət apardı*. Ə.Vəliyev. **Söhbət etmək** – bir yerdə oturub danışmaq. [Rüstəm bəy:] *Bir neçə nəfər dost-aşna çağırmışam, indi bu saat gələrlər, oturub söhbət edərik.* Ü.Hacıbəyov. *İş üçün gələn kəndlilərlə həmişə Mirzə şirin dillə zarafat eyləyərək söhbət edərdi.* Ə.Haqverdiyev. *Qurban ilə Məsmə xala bir qədər söhbət elədilər*. S.Rəhman. **Söhbətə tutmaq** – danışığa tutmaq, söhbətlə başını qarışdırmaq, söhbətlə fikrini yayındırmaq. *Pəri* [Bəhramın] *başını qarışdırıb, söhbətə tutur*. C.Cabbarlı. **Söhbəti ayrı yerə salmaq** – söhbəti dəyişdirmək, söhbət zamanı mətləbi qoyub başqa məsələyə keçmək. *Səriyyə xala qızın utandığını görüb söhbəti ayrı yerə saldı.* S.Rəhman.

**SÖHBƏTARASI** *zərf* Söhbət əsnasında, söhbət zamanı. *Söhbətarası işarə vurmaq. Söhbətarası başa salmaq. – Qaraqum səhrasının bu gənc novatorunu; Qızlar söhbətarası məhəbbətlə anırdı*. S.Rüstəm. *O, söhbətarası durdu ayağa; Yandakı otağa apardı məni.* Z.Xəlil.

**SÖHBƏTCİLLİK** *is.* Söhbətcil adamın xasiyyəti, söhbət etməyi sevmə.

**SÖHBƏTCİL, SÖHBƏTÇİ** *sif.* Söhbət etməyi sevən, yaxşı, maraqlı söhbətlər etməyi bacaran. *Söhbətcil adam.* – [Bir kişi:] [Məşədi Səttar] *bir söhbətcil arif adam idi.* Ə.Haqverdiyev. *Adətən söhbətcil olan Qara Kərəmoğlu və Zeynəb Quliyeva da susmuşdu.* M.İbrahimov.

**SÖKDÜRMƏ** "Sökdürmək"dən *f.is.*

**SÖKDÜRMƏK** *icb.* 1. Sökmə işi gördürmək. *Paltarı sökdürmək*.

2. Sökməyə, dağıtmağa məcbur etmək, dağıtdırmaq, uçurtdurmaq. *Evi sökdürmək.*

**SÖKMƏ** "Sökmək"dən *f.is.*

**SÖKMƏK** *f.* 1. Qurulmuş bir şeyi uçurtmaq, dağıtmaq, yıxmaq. *Hasarı sökmək. Köhnə evi söküb təzəsini tikdilər. – Bir neçə yerdə əli belli və kürəkli kişilər uçuq damların daşını və torpağını sökməkdə idilər*. C.Məmmədquluzadə. *Kəblə İsrafil iki atlını evin dalında qoymuşdu ki, Bəndalı damı söküb arxadan qaçmasın*. Mir Cəlal. // Qurulu bir şeyi hissələrinə ayırmaq. *Maşını sökmək. Cihazı sökmək.*

2. Tikişini açmaq. *Döşəyini söküb paketi yunların arasına soxdu*. H.Nəzərli.

3. Xam torpağı işləmək, açmaq, qaldırmaq. [Muxtar kişi Adiləyə:] *Eşidirsən təpənin dalından gələn o gur səsi? Təzə aldığımız traktordur, güney talada xam torpağı sökür*. Ə.Məmmədxanlı. *Kotan yeri sökən kimi, Nəcəfalı qarda şırım aça-aça getdi.* B.Bayramov.

4. İşıqlaşmaq, işıqlaşmağa başlamaq; işıqlandırmaq. *Oyadır səhər-səhər; Quşlar məni yuxudan; Elə bil ki, mənimçin; Yenə sökür qızıl dan.* N.Xəzri. *Sarımtıl fişəng işığı yanvar gecəsinin qatı qaranlığını sökərək, yuxarı qalxdıqca zülmət seyrəlir*. Ə.Əbülhəsən.

5. *məc.* Parçalamaq, dağıtmaq, məhv etmək (bu mənada bəzən "söküb-dağıtmaq" şəklində işlənir). *Zahirdi qəmzənin cigər sökməyi; Can almağı, nahaq qanlar tökməyi*. Q.Zakir. [Qız:] *Vərəm ciyərlərimi söküb-dağıtdıqca qüvvədən düşdüm*. Ə.Məmmədxanlı.

**SÖKÜK** *sif.* 1. Sökülmüş, uçulmuş, dağılmış halda olan. *Sökük divar. Sökük döşəmə. Sökük daxma. – O zaman kolxoz idarəsi iki otaqdan ibarət köhnə və yan-yörəsi sökük bir binada yerləşirdi*. M.İbrahimov. [Cinayətkar adamlar] *..dar dalanlar, sökük hasarlar, ucqar məhəllələr, kimsəsiz səhralar axtarır, öz çir-*

*kin işlərini belə yerlərdə görürdülər*. H.Seyidbəyli. // *is*. Binanın və s.-nin sökülmüş yeri. *Evin sökükləri görünür. Divarın söküklərini təmir etmək.*

2. Tikişi, sapı, hörgüsü açılmış, sapı qaçmış. *Sökük xalça. Sökük papaq. Sökük ətək.* – [Mürsəl:] *..Sınıq qələm, sökük zənbil heç kəsin evində yoxdur*. Mir Cəlal. // *is.* Paltarın və s.-nin tikişi, sapı açılmış yeri. *Paltarın söküyünü tikmək. Corabın söküyünü gözəmək.*

**SÖKÜLMƏ** "Sökülmək"dən *f.is.* [Şahlar] *eyvanda dayanıb şəfəqin sökülməsinə tamaşa edirdi.* B.Bayramov.

**SÖKÜLMƏK** *f.* 1. Tikişi açılmaq. *Paltarımın qolu sökülüb. Paltonun astarı sökülüb.* – *Ələsgər, ağlayır qızlar, arvadlar; Söküldü döşəklər, yorğan qalmadı*. Aşıq Ələsgər.

2. *məch.* Uçurulmaq, dağıdılmaq (qurulu bir şey). *Çal-çəpər sökülüb dağılmışdı. Malqara sürtünüb bəzi ağacların tənəyini salmışdı.* B.Bayramov. // Məc. mənada. [Məşədi İbad:] *Ə kişi, vallah, mən dağıldım, mən söküldüm, mən bu qədər pulu haradan alım verim?* Ü.Hacıbəyov.

3. İşıqlanmaq, açılmaq (adətən "üfüq", "şəfəq" və s. sözlərlə). *Dan yeri söküləndə; Zülf üzə tökülində; Şeh düşmüş gülə bənzər; Ağ üzdən öpüləndə.* (Bayatı). *Yolda açdım səhəri; Üfüq üzümə güldü; Qızıl donlu dan yeri; Gözlərimdə söküldü.* Ə.Kürçaylı.

**SÖKÜNTÜ** *is.* 1. Paltarda və s. tikilmiş şeydə sökülmüş, tikişi açılmış, ipi qaçmış yer. *Qolunda söküntü görünür*.

2. Sökülmüş şeyin qırıntıları, hissələri. *Maşının söküntüləri yerə tökülmüşdü*.

**SÖKÜŞDÜRMƏ** "Söküşdürmək"dən *f.is.*

**SÖKÜŞDÜRMƏK** *f.* Dartışdırmaq, didmək. *..Bir balaca uşaq bir övrətin döşlərini ağlaya-ağlaya söküşdürürdü.* C.Məmmədquluzadə.

**SÖNDÜRMƏ** "Söndürmək"dən *f.is.*

**SÖNDÜRMƏK** *f.* 1. Keçirmək (yanan şeyi). *Papirosu söndürmək. İşığı söndürmək. Yanğını söndürmək.* – *Otaqda lampanı söndürmüşdüksə də, ancaq Ayın şöləsi pəncərədən düşüb otağın yarısını işıqlandırmışdı*. M.Rzaquluzadə.

2. *məc.* Yatırtmaq, boğmaq, qabağını almaq. *Həvəsini söndürmək. Ədavəti söndürmək. Ehtirasını söndürmək.*

**SÖNDÜRÜCÜ** *is. xüs.* Yanan bir şeyi, yanğını, işığı və s.-ni söndürməyə məxsus cihaz, alət və s. // Sif. mənasında. *Söndürücü maddələr*.

**SÖNDÜRÜLMƏ** "Söndürülmək"dən *f.is.*

**SÖNDÜRÜLMƏK** *məch.* Keçirilmək (yanan şeyi). *Beş-on dəqiqədən sonra yanğın da söndürüldü*. M.Hüseyn. *Bu işıqlar tapdanıb söndürülən* (f.sif.) *nəhəng bir tonqalın közərən qığılcımlarına bənzəyir*. M.Rzaquluzadə.

**SÖNMƏ** "Sönmək"dən *f.is.*

**SÖNMƏK** *f.* 1. Keçmək (yanan şey). *Ocaq söndü. Lampa söndü.* – *..Ocağın alovu sönüb tamam olurdu*. A.Divanbəyoğlu. [Pəncərə] *şairin pəncərəsi idi ki, yalnız sübhə yaxın ağ vərəqlərin rəngi sarıya çalanda onun çırağı sönərdi*. Ə.Məmmədxanlı.

2. Qaralmaq, işığı kəsilmək. *Daş əriyər, günəş sönər; Çıxmaz o gün yaddaşımdan*. R.Rza. *Səhər ovuna gecikməmək üçün hələ ulduzlar sönməmiş evdən çıxdıq*. M.Rzaquluzadə.

3. *məc.* Sakitləşmək, azalmaq, zəifləmək. *Ər-arvad ixtilafı nəinki sönmür, daha da alovlanırdı*. Mir Cəlal.

4. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: şam kimi sönmək, ümidi sönmək, ocağı sönmək və s.

**SÖNÜK** *sif.* və *zərf* 1. Parlaq olmayan, parlamayan və ya çox az parlayan; parıltısız. *Sönük işıq.* – *Dağların, bağların libası sarı; Günəşin də sönük ziyası sarı.* A.Səhhət. // *məc.* Solğun, ölgün, cansız. [Ay] *da Vaqif kimi eşq yorğunu olaraq, təpələr arxasından sönük çöhrəsi ilə aləmə tamaşa edir*. Çəmənzəminli. *Lakin bu suala cavab olmayaraq,* [Qasımın] *sönük gözləri həmişəlik yumuldu*. T.Ş.Simurq.

2. *məc.* Yekrəng, maraqsız, zəif. [Şair Ərəstun Şiraslana:] *Sənətkarlıqla yazılmış balaca şerin özü hər hansı sönük bir poemadan qat-qat üstündür.* S.Rəhimov. [Rasim Yavərə:] *Necə ola bilər ki, xırda və sönük əsərə müasir və yeni deyəsən?* M.İbrahimov.

**SÖNÜKLÜK** *is.* 1. Sönük şeyin halı.

2. *məc.* Ölgünlük, ruhsuzluq, cansızlıq; ruh düşkünlüyü. // *məc.* Yekrənglik, maraqsızlıq, zəiflik. *..Təbiətdə bunların əksini*

*gördükdə, bunun müqabilində rəssamın lövhəsinin sönüklüyünü dərk edir*(*sən*).. M.Rzaquluzadə.

**SÖR-SÖKÜNTÜ** b a x **söküntü** 2-ci mənada.

**SÖVDA** [*ər.*] b a x **ekzema**.

**SÖVDALI** b a x **ekzemalı**.

**SÖVDƏ** *is.* [*ər.*] Alver, alış-veriş. [Həkim gülüb dedi:] *Hacı ağa, belə də sövdə olarmı?* Ə.Haqverdiyev. [Əli Sərdara:] *Sövdənizin baş tutmaması, yəqin ki, heç xoşlarına gəlmədi*. P.Makulu. ☐ **Sövdə etmək** – alış-veriş etmək. [Hacı Qara:] *Əgər nağd pulunuz yox isə, mən yağ ilə sövdə edərəm, bəşərti ki, xalis inək yağı ola*. M.F.Axundzadə.

**SÖVDƏGƏR** *is.* [*ər.* sövdə və *fars.* ...gər] *köhn.* Parça alverilə məşğul olan adam, tacir, parça mağazası sahibi. [Hacı Saleh:] *Sənə məlumdur ki, bu şəhərin sövdəgərlərinin əksərini mən pullu etmişəm*. S.S.Axundov. [Qönçə:] [Mirzə Cəmil] *məni Şuşa qalasında bir sövdəgər oğluna vermək istəyirdi*. Ə.Vəliyev.

**SÖVDƏGƏRLİK** *is. köhn.* Sövdəgərin işi, peşəsi; parça ticarəti ilə məşğul olma. [Hacı Qara:] *..Mən bir fağır adamam, peşəm sövdəgərlikdir*. M.F.Axundzadə.

**SÖVDƏLƏŞMƏ** 1. "Sövdələşmək"dən *f.is.*

2. *məc.* Dilləşmə, uzlaşma; gizli saziş, razılıq, sözbirlik.

**SÖVDƏLƏŞMƏK** *f. köhn.* Alverdə, sövdədə razılığa gəlmək, saziş bağlamaq, razılıq əldə etmək, razılaşmaq. – *Sonra sövdələşərik, – deyib, tacir qeyri-müəyyən cavab verdi*. M.İbrahimov. *Gün olmaz ki, qızın özünə, ya nənəsinə deyən olmasın ki,* "*daha vaxtdır, bir halal süd əmmiş ilə tapışın, Allah xeyir versin, sövdələşin a!*" Mir Cəlal.

**SÖVQ** *is.* [*ər.*]: **sövq etmək** – 1) gətirmək, qabağına qatıb sürmək, aparmaq, irəli gətirmək; 2) təhrik etmək, səbəb olub bir nəticəyə aparıb çıxarmaq, çəkib aparmaq, cəlb etmək, məcbur etmək, vadar etmək. *Nəbini kəskin mübarizəyə, qaçaqlığa sövq edən torpaq məsələsi olmuşdur*. "Qaçaq Nəbi". *Fikrimi vermərəm əbəs siz kimi nadanlara; Sövq edəsiz oğlumu bir para hədyanlara*. M.Ə.Sabir.

**SÖVQİ-TƏBİİ** *is.* [*ər.*] b a x **instinkt**. *Əlbəttə, burada sövqi-təbiinin də qüvvətli bir amil kimi böyük rolu vardı.* Ə.Əbülhəsən. [Süleyman] *əlində yalın xəncər durmuş Nüsrəti görərkən bir sövqi-təbii ilə tez Həmidin yatağına doğru atıldı və elə bu anda Nüsrət də Həmidə sarı cumdu*. Ə.Məmmədxanlı. *Ancaq* [Kamalın] *əlləri, ayaqları ona tabe olmur, sövqi-təbii ilə bu ölüm təhlükəsindən çəkinirdi*. M.Rzaquluzadə.

**SÖVT** *is.* [*ər.*] Səs, səda. *Çıxanda sövtü o şirin kəlamımın, Seyyid; O sövtə başdan-ayaq guş olduğum gecələr*. S.Ə.Şirvani. *Xoş sövtlə söylənən sözlər təkcə-təkcə almaz danələri kimi düşüb göz şüşələrinə rəxnə salırdı*. Çəmənzəminli. // Hava, avaz. *..Tamam Gülüstan* ["Suliko" nəğməsini] *sövt ilə oxuyur*. F.Köçərli.

**SÖVTİYYAT** [*ər.*] *köhn.* b a x **fonetika**.

**SÖYKƏK** *is.* 1. Dayaq, söykənəcək; söykənmək üçün hər cür şey. *Salman söykəyə dirsəklənərək bir-iki dəfə öskürdü*. Ə.Vəliyev. *Növrəstə evdən mütəkkə gətirib Nəbiyə söykək qoydu*. Ə.Abasov. ☐ **Söykək vermək** – dayaq etmək. *Dirsəyə söykək vermək*. – *Oğlan qolunu Nərgizin başına söykək verdi*. B.Bayramov. **Söykək durmaq** – dayaq olmaq.

2. *məc.* Kömək, arxalanılacaq, dayanılacaq şey. ☐ **Söykək durmaq** – kömək etmək, dayaq olmaq. *Yıxılana söykək durmaq*.

3. Yavanlıq mənasında. *O kişi, atası rəhmətlik də bir yük kartof düzəldərdi, gətirib gələrdim, həm yavanlıq, həm də çörəyə söykək olardı*. S.Rəhimov.

4. Yapışıq, bitişik, söykənmiş, dayanmış, dirənmiş. *Dağın bir tərəfi meşəyə söykəkdi*. Ə.Vəliyev. *Az keçməmiş, meşəyə söykək bir yerdə tonqal çatıldı*. B.Bayramov.

**SÖYKƏKLİ** *sif.* və *zərf* Söykənmiş halda, söykənərək, dayanaraq. *Söykəkli yatmaq*. – [Səlim] *ayaq üstə ağaca söykəkli durdu*. S.Rəhimov.

**SÖYKƏMƏ** "Söykəmək"dən *f.is.*

**SÖYKƏMƏK** *f.* Dayamaq, dirəmək, yapışdırmaq. *Əlini başına söykəmək. Belini divara söykəmək*. – *Ağca başını oğlunun gen sinəsinə söykəyib mürgüləyirdi*. Ə.Əbülhəsən. *Nəriman yazı masasını şüşəbəndə söykəmişdi*. Mir Cəlal. *..Yaşar tüfəngin lüləsini üst daşa söykəyib nişan aldı*. M.Rzaquluzadə.

**SÖYKƏNƏCƏK** *is.* 1. Divanda, stulda, skamyada və s.-də kürəyi söykəmək üçün dayaq. [Qadın] *yun şalını umuzundan alıb kreslonun söykənəcəyinə saldı.* Ə.Əbülhəsən. *Qoşqar kürəyini stulun söykənəcəyinə verib, başını sinəsinə əydi.* İ.Hüseynov.

2. *məc.* Dayaq, istinadgah, arxa, kömək, himayəçi. [Səlimi] *bir yol axtarmalı idi. Özünə söykənəcək tapmalı idi.* M.İbrahimov. *Atalar oğul istər ki, qocalıqda söykənəcəkləri olsun*. Mir Cəlal.

**SÖYKƏNMƏ** "Söykənmək"dən *f.is.*

**SÖYKƏNMƏK** *f.* 1. Arxasını və ya bədənin bir yerini bir şeyə dayayaraq dayanmaq; durmaq, istinad etmək. *Bir daşa söykənib, tüfəngimi* [pələngə] *tərəf yönəltdim.* A.Şaiq. [Fərhad] *əvvəlcə sağ əlinə söykənib güclə qalxdı.* Ə.Vəliyev. *Gecə keçmiş, ulduzlar ağ, göy, qara; Söykənmişəm qocaman bir çinara*. R.Rza.

2. *məc.* Arxalanmaq, güvənmək, etibar etmək. *Atasına söykənmək. – Mollayev tək-tük nüfuzlu dostlarına arxalandığı halda, Aslanov saysız-hesabsız sıravi, sadə adamların gücünə söykənirdi*. M.Hüseyn. // *məc*. Əsaslanmaq, istinad etmək. *Qabaqcıl nəzəriyyəyə söykənmək. Faktlara söykənmək.*

3. Bir-birinə sıx qoyulmaq, durmaq. *Çuval çuvala söykənib. – Dalda kisələr bir-birinə söykənmişdi*. Ə.Əbülhəsən.

**SÖYLƏMƏ** "Söyləmək"dən *f.is.*

**SÖYLƏMƏK** *f.* Demək. *Nə söyləyirsən?* – [Sultan bəy:] *Qızım, sənin istədiyin, kimdir? Söylə görək*. Ü.Hacıbəyov. *Zeynal yavaşca addımlarla Mehribana yaxınlaşdı. Bir söz deyəcəkdi. Söyləməyə üzü gəlmirdi*. S.Hüseyn. // Anlatmaq, bildirmək, xəbər vermək. *Əhvalatı olduğu kimi söylədi. Bunu sizə kim söylədi? – Badi-səba, söylə mənim yarıma; Gözəllər çıxıbdı seyrana, gəlsin.* Q.Zakir. *Molla Fərzəli əsnəyə-əsnəyə bir kağız parçasını dizi üzərinə alaraq: – Həmşəri nə yazılacaq? Söylə! – dedi.* A.Şaiq.

**SÖYLƏNMƏ** "Söylənmək"dən *f.is.*

**SÖYLƏNMƏK** 1. *qayıd.* Öz-özünə danışaraq bir şeydən şikayətlənmək; deyinmək, donquldanmaq. *Pərdə açıldıqda Qulu otağı süpürərkən öz-özünə söylənir.* S.S.Axundov. *Hər kəs qonşuluğundakı tiryəki kişinin arxasınca deyib söylənirdi.* S.Hüseyn. *Üç-dörd qadın oturub əllərini ölçə-ölçə nə isə söylənirdi*. Ə.Vəliyev.

2. *məch.* Deyilmək, danışılmaq. *Bütün dağlar arasında İskəndər bəyin adı söylənirdi. İgidlikdə, at çapmaqda, düşmən bağrı yarmaqda tayı-bərabəri yox idi*. Ə.Haqverdiyev. *Söylənir haqqında uzun dastanlar; Deyirlər bitməzmiş onda bostanlar.* H.K.Sanılı. *Çingiz rəsmən Həsənin yanında söhbətlərə qarışmırdısa da, bunun əleyhinə söylənənlərin hamısına şərik idi*. Çəmənzəminli.

**söylənə-söylənə** *zərf* Deyinə-deyinə, donquldana-donquldana, öz-özünə danışa-danışa. *Söylənə-söylənə çıxıb getdi. Söylənə-söylənə iş görmək. – Pası söylənə-söylənə hövl ilə dönüb, o biri otağa keçdi.* S.Rəhimov. *Səhərlər xalam söylənə-söylənə məni oyadır, durub könülsüz halda dərsə gedirdim.* Ə.Məmmədxanlı.

**SÖYLƏŞMƏ** "Söyləşmək"dən *f.is.*

**SÖYLƏŞMƏK** *qarş.* Bir işin necə edilməsi haqqında danışmaq, müzakirə etmək; söhbətləşmək, dilləşmək, məsləhətləşmək. *İstəyirik bir iş açaq filməsəl; Söyləşirik bir-iki il laəqəl.* M.Ə.Sabir. *Yusif xeyli fikirdən sonra dedi: – Qızım, mənim fikrimə bir şey gəlir. Səninlə bir yerdə Peterburqa gedəlim. Bahadır ilə bir yerdə sözləşəlim, bəlkə birlikdə bir çarə tapdıq.* N.Nərimanov.

**SÖYLƏTMƏ** "Söylətmək"dən *f.is.*

**SÖYLƏTMƏK** *icb.* Söyləməyə məcbur və ya sövq etmək; danışdırmaq, dindirmək. *Hankı bir sərxoşu söylətdim, inan; Bəhs edər gördüm o, huşyarlıqdan.* H.Cavid. [Dərviş:] *Əgər mənim başıma gələndən xəbərin var isə, niyə məni söylətmək istəyirsən?* A.Divanbəyoğlu. [Kamal:] *Hələ altı-yeddi yaşlarından hər gecə nənəsinə bir-iki nağıl söylətməmiş yatmazdı.* M.Rzaquluzadə.

**SÖYMƏ** "Söymək"dən *f.is.*

**SÖYMƏK** *f.* Nalayiq, pis, ədəbsiz sözlərlə təhqir etmək. *Kişi evə qayıdıb götürür dəyənəyi və arvadına bir-iki çəkib başlayır söyməyə.* C.Məmmədquluzadə. [Əhməd:] *Əlbəttə, adam kasıb olanda onu söyərlər də, döyərlər də.* Ə.Haqverdiyev. // Pisləmək, danlamaq, kəskin sözlərlə məzəmmətləmək. *Geridə qaldığımız üçün bizi söyürlər. – Səlim*

*öz sadəliyinə zaman-zaman çox söymüşdü.* B.Bayramov.

**SÖYÜD** *is. bot.* Adətən sulaq yerlərdə bitən, ensiz yarpaqları, elastiki budaqları olan ağac və ya kol. *O tay-bu tay arx boyu düzülmüş cavan söyüdlərin zərif yarpaqları xəfif mehdən titrəşdilər.* İ.Əfəndiyev.

**SÖYÜDGÜLÜ** *is. bot.* Ətirli çəhrayı və ya ağ çiçəkləri olan, ensiz yarpaqlı, həmişəyaşıl kol-bitki. *Oleandr və ya söyüdgülü geniş becərilən bəzək bitkisidir, yarpaqları dəstə halında üç-üç düzülür. Bitki zəhərlidir, tərkibində storofantinə oxşar maddə vardır.* M.Qasımov. *Səfər kişi .. göy-göyərti əkib-biçir, şimala, cənuba gəlib-gedən yolçuların çoxunu söyüdgülü, ətirşahla qarşılayıb yola salır.* Mir Cəlal.

**SÖYÜDLÜ** *sif.* Söyüd ağacları olan, kənarlarında söyüd bitən. *Söyüdlü yollar. Söyüdlü bağlar. – Ey söyüdlü dərə, ey dumanlı dağ; Səfaya daldığım yerdir bu yerlər.* M.Müşfiq. *Həyat ona verib bütün rəngini; Söyüdlü çayların ilk ahəngini.* N.Xəzri.

**SÖYÜDLÜK** *is.* Söyüd ağacları olan yer, söyüd olan yer. [Miraxurla Səfər] *yaxındakı çayı keçib bir söyüdlükdə dayandılar.* Çəmənzəminli. *Biz görüşə gələndə söyüdlükdə durub tək; O gözləyir sübhədək.* Z.Xəlil.

**SÖYÜLMƏ** "Söyülmək"dən *f.is.*

**SÖYÜLMƏK** *məch.* Söyüşə məruz qalmaq. // Danlanmaq, məzəmmətlənmək. *Hər gün söyülürəm, hey danlanıram; Bəlkə danlaqlardan xoşhallanıram.* B.Vahabzadə.

**SÖYÜŞ** *is.* Nalayiq, qaba, təhqirli söz(lər). *Bu söz Qurban üçün söyüşdən də pis oldu.* T.Ş.Simurq. *Hacı Aslan söydükcə qızışır, qızışdıqca söyüşünü qəlizləşdirirdi.* S.Hüseyn. ☐ **Söyüş söymək** – qaba, nalayiq, təhqiredici sözlər söyləmək. *Nəzarətçi söyüş söydü və sağında dayanmış növbətçinin qırmızı yanağına əlinin tərsilə ağır bir sillə vurdu.* M.Hüseyn.

**SÖYÜŞÇÜ, SÖYÜŞCÜL** *sif.* və *is.* Söyüş söyməyə adət etmiş, çox söyüş söyən (adam). *Söyüşçü adam. – Fərəc bəy .. böyük şəhərlər gəzməsinə, məktəblərdə oxumasına baxmayaraq, çox kobud, olduqca söyüşcül, dedikcə davakar imiş.* Ə.Vəliyev.

**SÖYÜŞKƏN** b a x **söyüşçü**. *Nadinc, söyüşkən, bu doqquz yaşında uşaq bütün müəllimləri təngə gətirmişdi.* S.S.Axundov. *Bəy yekəxananın biriminci mülkədarı, söyüşkən zülmkarı idi.* S.Rəhimov.

**SÖYÜŞMƏ** "Söyüşmək"dən *f.is.*

**SÖYÜŞMƏK** *f.* Bir-birini söymək, bir-birinə nalayiq, qaba, təhqirli sözlər demək. *Qonşular bir az söyüşdükdən sonra iş vuruşmağa müncər oldu.* Çəmənzəminli. *Söyüşsələr də, döyüşsələr də .. bəzən Cəmil* [Səməndərin] *könlünü alar*(*dı*).. M.Hüseyn.

**SÖZ** *is.* 1. Bir şey və ya hadisə haqqındakı anlayışın səslə ifadəsindən ibarət olan nitq vahidi; kəlmə. *Sözün mənası. – Hamıya bir vahimə düşdü, söz demək istəyənlərin sözləri boğazlarında qurudu.* B.Talıblı. *Əşrəfin danışdığı gözəl sözlərə qulaq asanlar heyran qalırlar.* S.Rəhman.

2. Dil, nitq. *Doğma sözlərimizdən geniş istifadə etmək. Söz mədəniyyəti. Şairin silahı sözdür. – ..Hər kəs rusca, yainki erməni və gürcücə, yainki avropalılar işlətdikləri hürufat ilə yazı yazmaq bilir, – bizim sözlərimizi başa düşər və bilər ki, nə deyirik.* C.Məmmədquluzadə.

3. Danışıq, söylənilən şey, nitq. *Sözünü qiymətdən salmaq. Sözünü bilməyən adam. – İmran kişi necə qəzəblənmişdisə söz deməyə dili də gəlmirdi.* M.Hüseyn. *Telli sözlərini bu cümlələrlə bildirdi. – Bu bizim ölkəmizin dəbidir. Bizdə bir arvadlı ev çox azdır.* S.Hüseyn.

4. Əmr, göstəriş. *Sözündən çıxmamaq. Böyüyün sözün eşitmək. Onun sözü mənim üçün qanundur.*

5. Vəd. *Sözünü yerinə yetirmək. O, sözündə duran adam deyil.* – [Əsgər:] [Gülçöhrə] *amma əcəb sözü üstə dayanan qızdır.* Ü.Hacıbəyov. [Sona xala:] *..Qorxuram Bəşir sözündən qaça.* S.S.Axundov. [Aslan Anitaya:] *Komendant iki gün bizi tamam ac qoydu, ancaq heç birimiz sözümüzdən dönmədik.* S.Vəliyev.

6. Çıxıb danışmaq ixtiyarı, çıxış üçün icazə. *Söz istəmək. Son söz demək. Söz verməmək.* – [Kərbəlayı:] *Yol verin, ay qardaşlar, Mirzə söz danışmaq istəyir.* H.Nəzərli. *Züleyxa iclasın lap axırında söz aldı.* H.Seyidbəyli.

7. Ancaq cəm şəklində – **sözləri, sözlərinə** – musiqi yazılan ədəbi mətn. "*Sənsiz*" *romansının sözləri Nizaminindir. S.Vurğunun sözlərinə yazılmış romans.*

8. Fikir, mülahizə, rəy. *..Kişi sözünü deyib, dik-dik baxdı Məhəmmədhəsən əminin üzünə.* C.Məmmədquluzadə.

9. İş, hadisə mənasında. *Bu əhvalat ki indi istəyirəm nəql eləyim, çoxdanın sözüdür.* C.Məmmədquluzadə.

10. Şayiə, xəbər. *Ortalıqda söz dolaşır.*

◊ **Söz açılmaq** – bir şey haqqında danışılmağa başlanmaq, danışmaq üçün fürsət düşmək, yeri gəlmək. [Gültəkin Aydına:] *İndi söz açılmış, mən nə deyirəm: hamı mənə deyir ki, Aydın oynaq fikirli bir adamdır.* C.Cabbarlı. [Avqust:] *Yoldaşlar, söz açıldı, mən bu məsələni sizə xatırlatmaq istəyirəm.* S.Vəliyev. **Söz açmaq** – danışmaq, söhbət açmaq, haqqında danışmağa başlamaq. *İgid neftçi o günlərdən; Dönə-dönə söz açardı.* N.Rəfibəyli. *Deyin necə söz açmasın; Xudafərin körpüsündən.* H.Hüseynzadə. **Söz altında qalmamaq** – özünə toxunan sözün qarşılığını, lazımi cavabını dərhal verə bilmək. *Həkim çox görüb-götürmüş adam olduğundan, söz altında qalmadı.* Ə.Vəliyev. *Büləndin eşitdiyi sözə dodağı qaçır, gözündə şirin bir təbəssüm oynayırdısa, deməli, o, söz altında qalmayacaqdı.* Ə.Əbülhəsən. **Söz aramızda** – danışılan sözün gizli qalmalı olduğunu bildirir. *Söz aramızda, heç qızdan xoşum gəlmir.* **Söz atmaq** – 1) birinin fikrini bilmək üçün bir söz demək, işarə vurmaq, eşitdirmək. *Söz atdım, cavab gəlmədi*; 2) üstüörtülü şəkildə söz demək, sataşmaq. *Xanım yola düşdükdə bu da ardınca gedib söz atırdı.* Çəmənzəminli. *Ruxsara çamadanı götürüb qapıdan çıxarkən Gülöyşə arxadan: – Sağ gedib, salamat gələsən, ay qız! – deyərək söz atmışdı.* S.Rəhimov. **Söz çıxartmaq** – şayiə yaymaq. *Ay uzana-uzana; Sözüm düşdü yazana; Hər adam sözü bilməz; Söz çıxardar yazana.* Ə.Cavad. **Söz (sözü, sözləri) dəymək** – sözdən incimək, sözü toxunmaq. *Pasının iyrəndirici sözləri Həsiyə güllə kimi dəydi.* S.Rəhimov. **Söz döyüşdürmək** – b a x **söz güləşdirmək**. **Söz düşmək** – b a x **söz açılmaq**. *Nağıl qurtaranda uşaqlar arasında kimin qorxaq olmağından söz düşdü.* M.Hüseyn. **Söz eləmək** – dedi-qodu, söz-söhbət üçün hədəf olmaq, dedi-qodu salmaq. [Rübabə] *bilirdi ki, qızın oğlana qoşulub getməsini söz eyləyərlər.* Mir Cəlal. [Səriyyə:] *Burada qız xeylağının oxumağını söz elərlər.* İ.Əfəndiyev. **Söz gəlmək** – töhmət olunmaq, töhmət gəlmək. *Sənin üstündə mənə söz gəldi.* **Söz gəzdirmək** – xəbərçilik eləmək. *Nə gülündən bülbül ayrılmaz, nə aşiq yardən; Ortada söz gəzdirən naəhl əğyar olmasa!* Ə.Vahid. **Söz güləşdirmək** – boş-boşuna, yersiz mübahisə etmək, mübahisəyə girişmək. [Maya:] *Onda da* [Rüstəm] *deyəcək ki, arvadsan, get işinə, kişi ilə söz güləşdirmə.* M.İbrahimov. [Dilşad Lətafətə:] *Mənimlə söz güləşdirirsən?* İ.Əfəndiyev. **Söz qoşmaq** – 1) şeir demək. [C.Cabbarlı] *bəzən xoşuna gələn adamlar barədə gülməli sözlər qoşardı.* M.Arif. *Aşıqlar* [Yaquta] *söz qoşaraq, saz çalıb mahnı oxuyurdular.* Ə.Məmmədxanlı; 2) araya qoymaq, lağa qoymaq, məsxərə etmək, dolamaq. **Söz qoymaq** – b a x **sözü bir yerə qoymaq**. *Bir gün xanlar xanı Bayandır xanın qonaqlığında Baybura bəy ilə Baybecan bəy söz qoymuşdular.* M.Rzaquluzadə. *Söz qoyurlar görüşüb; Sevda, Adilə, Zivər.* M.Seyidzadə. **Söz olmaq** – dedi-qoduya mövzu olmaq. *Bulaq başı toz olar; Üstü dolu qız olar; Əyil dəsmalın götür; Mən götürsəm söz olar.* (Bayatı). **Söz salmaq** – bir şəxs və ya şey haqqında danışmaq, söhbət eləmək. *Məryəm Səlimdən nigaran idi. Qulağı həmişə səsdə idi: bəlkə mədəndən qayıdan atası Səlimin adını çəkə, ondan söz sala.* İ.Qasımov. **Söz tutmaq** – söz təsir etmək, bərk toxunmaq, sözdən pərt olmaq, tutulmaq. *Onun söz tutmayan dodaqlarından; Bir sərxoş qəhqəhə qopdu, yayıldı; Yuxudaymış kimi, birdən ayıldı.* B.Vahabzadə. **Söz vermək** – vədə vermək, öhdəsinə götürmək. [Gülsabah:] *Sizə söz verirəm ki,* [Qüdrət Arslan] *yazar.* C.Cabbarlı. [Ana:] *Söz verirsən?* [Nərgiz:] *Anamın canı üçün.* Ə.Məmmədxanlı. **Söz yox** – əlbəttə, şübhəsiz. **Söz yoxdur** – şübhə yoxdur, əladır. **Sözə baxmaq** – deyilən sözə əməl etmək, deyiləni qəbul etmək, qulaq asmaq. [Ana Nərgizə:] *Sən mənim sözümə baxsan, mən heç vaxt ağlamaram.* Ə.Məmmədxanlı. **Sözə**

**gəlmək** – mübahisəsi çıxmaq, sözləşmək, mübahisə eləmək, toqquşmaq. *Zeynəb də .. ağlayırdı, nəinki məhz oğluynan sözə gəlmək üstə, xeyr, ancaq keçən günləri yadına düşmüşdü.* C.Məmmədquluzadə. *Çimnaz arvad çarşab almaq barədə Veyslə əməlli sözə gəlmişdi.* Ə.Əbülhəsən. **Sözü azdırmaq** – əsas mətləbdən uzaqlaşdırmaq, yayındırmaq. [Murtuz:] *Yaxşı, Göyüş, bunlarda işimiz yox. Gəl, sözü azdırma.* Ə.Abbasquliyev. **Sözü bir yerə qoymaq** – hamı bir qərara gəlmək, sözü bir eləmək, dilləşmək. **Sözü keçmək** – hörməti, nüfuzu olmaq, sayılmaq. [Gülgəz Hacıya:] *..Özün deyirsən ki,* [Aslanın] *divan-dərədə hörməti var, sözü keçir*. C.Cabbarlı. **Sözü uzatmaq** – mətləbdən kənar danışmaq, mətləbi uzatmaq, uzunçuluq eləmək. *Dilmanc dəxi səbir eləmədi və qoymadı Yarməmməd sözü uzatsın.* C.Məmmədquluzadə. **Sözü yerə düşmək** – xahişi, istəyi, arzusu, tələbi nəticəsiz qalmaq, qəbul olunmamaq, rədd edilmək. **Sözü yerə düşməmək** – xahişi, tələbi yerinə yetmək, nəticəsiz qalmamaq, qəbul olunmaq. [Hacı Qurban:] *..Sənin heç yerdə sözün yerə düşməyibdir.* N.Vəzirov. **Söz (sözünü) qaytarmaq** – qabacasına cavab vermək, etiraz etmək. [Veys] *ömründə sözünü qaytarmadığı, həmişə hörmət etdiyi müəllimin pencəyinin ətəyindən tutdu, ağlamsıl, bir az da yalvarıcı səslə dedi.* Ə.Əbülhəsən. **Sözündən çıxmaq** – deyilənə qulaq asmamaq, əməl etməmək, yerinə yetirməmək. [Zibeydə Səkinə xanıma:] *Sən nəkarəsən ki, mənim sözümdən çıxasan*. M.F.Axundzadə. [Səməd:] *Ağam nə desə olur. Heç birisi onun sözündən çıxmaz*. B.Talıblı. **Sözünə baxmaq (qulaq asmaq)** – deyilən sözə əməl etmək, deyiləni qəbul etmək. [Sərvər Gülnaza:] *Ola bilsin ki, bu gün deyər və bir də sənə nə deyəcəkdir. Sənin borcun onun sözünə qulaq asmaqdır.* Ü.Hacıbəyov. *Uşaq böyüyün sözünə baxar*. S.Rəhimov. **Sözünü kəsmək, sözünü ağzında qoymaq** – danışmağa imkan verməmək, sözünü yarımçıq qoymaq. *Aslan səbirsizliklə* [Lazarın] *sözünü kəsib, incimiş halda dedi.* S.Vəliyev. *Oğlan onun sözünü ağzında qoydu: – Əvvəla onu deyim ki, burada milislik heç bir şey yoxdur*. Q.İlkin. **Atalar sözü** – b a x **ata**. *Mənə də müəllimimiz atalar sözündən bir hekayə düzəldib yazmağı əmr etmişdir.* S.S.Axundov.

**SÖZANLAYAN** *sif.* və *is.* Sözü, mətləbi, işarəni tez dərk edən, başa düşən; arif.

**SÖZARASI** *ara s.* Yeri gəlmişkən, yeri gəldikcə, söhbət əsnasında. *Mirzə Kərim maaşının azlığını sahibkar olan Ağa Murad bəyə sözarası neçə dəfə söyləmişdisə də, lakin quru vəddən başqa bir şey almamışdı*. T.Ş.Simurq. *..Rüstəm kişi sözarası ferma müdiri haqqında Kələntərin təklifini lağa qoyub gülmüşdü*. M.İbrahimov.

**SÖZARDI** *is.* Əsərin (kitabın) axırında müəllif və ya naşir tərəfindən verilən son izah, məlumat, son söz.

**SÖZBAŞI** 1. *zərf* Hər sözün əvvəlində, tez-tez. *Hacı hər sözbaşı gözünün ucu ilə ona baxıb qorxa-qorxa davam edirdi.* Mir Cəlal.

2. *is.* Giriş ( kitabda, əsərdə və s.-də).

**SÖZBAZ** *sif.* və *is.* Dedi-qoduçu, sözgəzdirən, qeybətçi, xəbərçi, uydurma sözlər yayan, söz şişirdən. *Sözbaz adam. Sözbazın biridir.*

**SÖZBAZLIQ** *is.* Dedi-qoduçuluq, xəbərçilik, şayiə yayma, sözü şişirdib yayma, sözbazlıq eləmə.

**SÖZBƏSÖZ** *zərf* Kəlməbəkəlmə, bir-bir, kəlmə-kəlmə. *Sözbəsöz oxumaq.*

**SÖZBİR: sözbir eləmək (olmaq)** – sözü bir yerə qoymaq, gizlicə sözləşmək. [Mirzə:] *Sözbir, əlbir olandan sonra yenə də* [korluq] *çəkmərik*. Mir Cəlal.

**SÖZBİRLİK** *is.* Sözü bir eləmə, sözbirliyi, dilbirlik.

**SÖZÇÜLÜK** *is.* və *sif.* Əsərdə, danışıqda yığcamlığa, məzmunun dərinliyinə, dolğunluğuna deyil, artıq sözlərə, uzunçuluğa yol vermə.

**SÖZDƏYİŞDİRİCİ**: **sözdəyişdirici şəkilçi** *dilç.* – ayrılıqda işlənməyən və sözlərin maddi hissəsinə bitişərək sözlər arasındakı qrammatik münasibəti bildirən, yəni həmin sözləri cümlədəki roluna görə bir-birinə bağlayan şəkilçi.

**SÖZDƏYİŞMƏ** *is. dilç.* Dildə sözlərin dəyişməsi, habelə belə dəyişmənin üsulları. *Sözdəyişmənin məhsuldar növləri.*

**SÖZDÜZƏLDİCİ: sözdüzəldici şəkilçi** *dilç.* – ayrılıqda işlənməyən, köklə sözdəyiş-

dirici şəkilçilər arasında yer tutan, yəni sözlərin maddi hissəsinin axırlarına bitişərək, sözlər arasındakı qrammatik münasibəti deyil, sözlərin əsil mənalarını dəyişdirən şəkilçi.

**SÖZDÜZƏLTMƏ** *is. dilç.* Dildə sözlərin düzəlməsi, habelə bu düzəlmənin üsulları.

**SÖZƏBAXAN** *sif.* Məsləhət qəbul edən, deyilənə əməl edən, razılaşan, söz eşidən, sözə qulaq asan. *Sözəbaxan oğlandır.*

**SÖZƏBAXMAZ, SÖZƏBAXMAYAN** *sif.* Deyilənə əməl etməyən, məsləhət qəbul etməyən, sözə qulaq asmayan. *Sözəbaxmaz uşaq.*

**SÖZGƏLİŞİ** *zərf* Yeri gəlmişkən, yerində, elə belə, məsəl üçün. [Balaş:] *Dilbər, mən onu demədim, mən sözgəlişi deyirəm.* C.Cabbarlı. [Vəfadar Səkinəyə:] *Sözgəlişi deyirəm, ürəyinə pis şey gəlməsin.* M.İbrahimov.

**SÖZGƏZDİRƏN** *sif.* və *is.* Sözyayan, xəbərçi; arada söz, xəbər aparıb gəzdirən.

**SÖZGÖTÜRMƏYƏN, SÖZGÖTÜRMƏZ** *sif.* Məğrur, mütəkəbbir, dikbaş. *Səkinə ərinin özünüsevən, sözgötürməz bir adam olduğunu bilirdi.* M.İbrahimov.

**SÖZLƏŞMƏ** "Sözləşmək"dən *f.is.*

**SÖZLƏŞMƏK** *f.* 1. Bir-birilə danışıb razılığa gəlmək, razılaşmaq, müəyyən qərara gəlmək; qərarlaşmaq. *Elçilər sözləşib evə qayıdırlar. Qurbanquluya xəbər verirlər ki, ona bir qız almışlar.* T.Ş.Simurq. [Babəklə Cavidan] *sözləşdilər, səhər açılanda Babək də onlarla birlikdə yola çıxdılar.* M.Rzaquluzadə.

2. Aralarında söz olmaq, davaları, mübahisələri düşmək, söyüşmək, sözə gəlmək. *Qonşu ilə sözləşmək.* – [Səfi bəy:] *Dayı, deyəsən, yenə Şəmsi ilə sözləşmisən, çox hirsli gedirdi, mənə də məhəl qoymadı.* S.S.Axundov. *Kərimov Aydınla sözləşəndən sonra özünü qalib hiss edir.* H.Seyidbəyli.

**SÖZLÜ** *sif.* Deməyə sözü olan, ürəyində sözü olan, nə isə bir söz demək istəyən. *Gülsabah atasının tez-tez ona baxmasının mənasını anladı; sözlü adam olduğunu başa düşüb, balkona çıxdı.* Ə.Vəliyev. *Sözlü adama oxşayırsan, Bağır, – deyə* [Səttarxan] *diqqətlə ona baxdı.* P.Makulu.

**SÖZLÜK** *is.* Lüğətlərdə izah və ya tərcümə ediləcək sözlərin tərkibi, lüğət üçün toplanmış sözlərin siyahısı. *İzahlı lüğətin sözlüyü. Lüğətin sözlüyünü tutmaq.* // Bəzən lüğət mənasında işlənir. *Terminoloji sözlük.*

**SÖZ-SOV** *is.* Danışıq, söz, dedi-qodu, mübahisə, narazılıq. *Əsgər bostan suvaranların danışığını və söz-sovlarını qaldırmaq üçün Kosanın bostanına çatacaq miqdarında su artırdı.* S.Rəhimov. [Pərşan:] *Qadanızı alım, qızlar, bir də əyər-əskiyi yoxlayın ki, söz-sov olmasın.* M.İbrahimov.

**SÖZ-SÖHBƏT** 1. Söhbət, danışılan sözlər. *Söz-söhbəti naz oğlan; Keyf-damağı saz oğlan; Özün gələ bilməsən; Nə sözün var yaz, oğlan.* (Bayatı). *Nə sözüm-söhbətim, nə həmdəmim var; Dərdim ürəyimdə pünhan, ağlaram.* S.Vurğun. [Camal:] *Necəsən, Nəbi dayı? Evdə darıxdım. Gəldim, bir söz-söhbət eləyək.* Ə.Abasov.

2. B a x **söz-sov**. *Zənnimcə, isti-isti boşaldarsam könlümü; Sonralar aramızda artıq söz-söhbət olmaz.* S.Rüstəm. *Adam var ki, sözdən-söhbətdən həzz alar.* Ə.Abasov.

**SÖZSÜZ** *sif.* və *zərf* 1. Danışmadan, söz demədən, sözlə başa salmadan, sözlə ifadə etmədən. *Sözsüz rol.* – [Komandir:] *Biz o qədər ünsiyyət bağlamışıq ki, sözsüz də bir-birimizi anlayırıq.* M.İbrahimov. *Plantasiyadakı sözsüz mahnı get-gedə genişlənib güclənirdi.* H.Seyidbəyli.

2. Danışıqsız, qeydsiz-şərtsiz, etirazsız. *Göstərişə sözsüz əməl etmək. Əmri sözsüz yerinə yetirmək.*

**SÖZSÜZCƏ** *zərf* Heç bir söz demədən, dinmədən, danışmadan, etirazsız. *Təklifi sözsüzcə qəbul etdilər.*

**SÖZSÜZ-SOVSUZ** *zərf* Danışıqsız, mübahisəsiz, etirazsız, sakitcə. *Abbas kişi hər işi sakitcə, sözsüz-sovsuz görməyi sevirdi.* Ə.Vəliyev. – *Kimsən, aşağı düş, – deyə çığırdı. O, sözsüz-sovsuz ağacdan düşüb əllərini yuxarı qaldırdı.* M.Rzaquluzadə.

**SÖZÜBÜTÖV, SÖZÜBÜTÜN** *sif.* Dediyi sözün üstündə duran, sözündə sabit duran, dediyinə mütləq əməl edən. [Məşədi] *..onun sözübütöv adam olduğunu yaxşı bilirdi.* S.Rəhimov.

**SÖZÜDÜZ** b a x **sözübütöv**.

**SÖZÜKEÇƏN, SÖZÜKEÇƏR** *sif.* Hörmətli, nüfuzlu. *Sözükeçən adam.* – [Hacı Sultan] *sözükeçər ağsaqqalların iştirakı ilə Həsənağa ilə olan ixtilafını həll etmək istədi.* S.Hüseyn.

**SPARTAKÍADA** [*xüs. addan*] İdman komandaları və cəmiyyətlərinin idmanın müxtəlif növləri üzrə kütləvi yarışı (bu, bir neçə idman növü üzrə birlikdə aparılan yarışlardır, həmin yarışlarda da qabaqcıl kollektivlər, komandalar və idmançılar aşkara çıxarılır).

**SPÁZMA** [*yun.*] Müəyyən əzələnin və ya əzələ qrupunun bir müddət sıxılması, yığılması, qıc olması.

**SPAZMATÍK** *sif.* [*yun.*] Spazma nəticəsində olan, spazma ilə bağlı olan, spazmadan törəyən. *Spazmatik öskürək. Spazmatik ağrı.*

**SPEKTR** [*lat.* spectrum – görmə] İşıq şüaları; prizmadan və ya digər şüasındıran mühitdən keçərkən əmələ gələn rəngli zolaq. *Spektrin əsas rəngləri. İşıq spektri.*

**SPEKTROSKÓP** [*lat.* spectrum – görmə və *yun.* scopeo – baxıram] Spektrləri müşahidə etmək üçün cihaz.

**SPÉRMA** [*yun.* spermo – toxum] *fiziol.* Erkək (insan və heyvan) tənasül vəzilərinin hasil etdiyi maye; toxum, məni.

**SPERMATOZÓİD** [*yun.* sperma (spermatos) – toxum və zoon – canlı və eidos – növ] *fiziol.* Kişi tənasül hüceyrəsi.

**SPESİFİKA** *is.* [*lat.*] Özümlük, özünə məxsusluq, yalnız ona xas olan.

**SPİDÓMETR** [*ing.* speed – sürət və *yun.* metreo – ölçürəm] Avtomobillərdə, motosikllərdə sürəti və keçilən məsafəni göstərən cihaz.

**SPÍKER** *is.* [*ing.*] 1. Parlament sədri.

2. Boks yarışında hakimlərin qərarını tamaşaçılara bildirən hakim.

**SPİNNİNQ** *is.* [*ing.*] Balıq tutmaq üçün uzun tilov.

**SPİRÁL** *is.* [*lat.*] Buruq məftil, burulmuş məftil.

**SPİRANT** *is.* [*lat.*] Nəfəsli samit.

**SPİRİT** *is.* [*lat.*] Ölülərin ruhunu çağıran və onlarla əlaqə yarada bilən adam.

**SPİROXÉT** [*lat.* spira – əyri və *yun.* choete – uzun tük] Uzun spiral sap şəklində bakteriya.

**SPİROMÉTRİYA** *is.* Ağciyərin tutumunu ölçmək üsulu.

**SPİRT** *is.* [*lat.* spiritus] 1. Tərkibində çoxlu kraxmal və şəkər olan (buğda, kartof və s.) məhsullardan distillə yolu ilə alınan alışqan maye. *Naznaz pambığı spirtə batırdı, Qaraşın barmağını silib təmizləməyə başladı.* M.İbrahimov.

2. *kim.* Öz tərkibində hidrogen atomu ilə oksigen atomu birləşmələri olan bir sıra üzvi birləşmələrin adı. *Kamfor spirti.*

**SPİRTLİ** *sif.* 1. Tərkibində spirt olan, spirtlə hazırlanan. *Spirtli içkilər.*

2. Spirtdə isladılmış, spirt vurulmuş. *Spirtli cuna. Spirtli pambıq.*

**SPİRTÖLÇƏN** *is. xüs.* Spirtli mayelərdə spirtin miqdarını göstərən cihaz. *Spirtin dərəcəsini spirtölçənlə təyin edirlər.*

**SPONSOR** *is.* [*ing.*] Müəyyən bir müəssisəni, layihəni və s. maliyyələşdirən hüquqi və ya fiziki şəxs.

**SPONTAN** *sif.* [*lat.*] Heç bir xarici təsir olmadan öz-özünə meydana çıxan; bədahətən.

**SPORT** [*ing.* sport] Orqanizmi möhkəmlətmək və inkişaf etdirmək və insanda iradi keyfiyyətlər tərbiyə etmək məqsədilə edilən fiziki mümarisələr (gimnastika, güləşmə, müxtəlif oyunlar və s.); idman. *Sportla məşğul olmaq. Sportu sevmək. – Əlavə, xanın sporta böyük həvəsi var imiş.* Ə.Haqverdiyev. *Ovçuluq yalnız xalq təsərrüfatı nöqteyi-nəzərindən deyil, sport və ölkə müdafiəsi nöqteyi-nəzərindən də böyük əhəmiyyətə malikdir.* M.Rzaquluzadə.

**SPORTÇU** *is.* Sportu peşə etmiş adam, müntəzəm surətdə sportla məşğul olan adam; idmançı. [Səlim:] *Darülfünun sportçuları arasında özünün qüvvəti ilə məşhur idi.* S.Hüseyn.

**SRAĞAGÜN** *zərf* Deyilən gündən iki gün qabaq, dünəndən qabaqkı gün. *Heç kəs* [Rəhilənin] *sözlərini eşitməsin deyə pıçıldadı: – Zəfər dayını srağagün tutublar..* M.Hüseyn. *Hər şeyi o qədər aydın görüb, hiss edirəm ki, elə bil bunlar hamısı dünən, srağagün baş verib.* İ.Əfəndiyev.

**SRAĞAGÜNKÜ** *zərf* Srağagün olmuş, srağagünə aid. *Srağagünkü iclas. Srağagünkü oyun. Srağagünkü əhvalat. – Srağagünkü turnirdə Zəki qiyamət edirdi.* M.Süleymanov.

**SSENÁRİ** [*ital.*] 1. Kinofilmin məzmununu təfsilatı ilə şərh edən və onun tərtibat cəhətlərini göstərən ədəbi əsər. *Filmin ssenarisi.*

2. *teatr.* Dram əsərinin planı, süjet sxemi.

3. *teatr.* Pyesdə iştirak edənlərin siyahısı (burada onların çıxış vaxtı və qaydası da göstərilir).

**SSENARİÇİ, SSENARÍST** *is.* Ssenari yazan, ssenari müəllifi.

**SSRİ** Sovet Sosialist Respublikaları İttifaqı.

**STABÍL** *sif.* [*lat.*] Sabit, daimi, dəyişməz. *Stabil dərslik.*

**STABİLİZÁTOR** [*lat.* stabilis – sabit] *xüs.* 1. Hərəkət zamanı cismin sabitliyini saxlamaq üçün qurğu, cihaz. *Avtomobilin stabilizatoru.*

2. Hər hansı bir kəmiyyətin sabitliyini saxlamaq üçün qurğu. *Gərginlik stabilizatoru.*

**STABİLLİK** *is.* Sabitlik, daimilik, dəyişməzlik.

**STADİÓN** [*yun.*] Sport-idman məşğələləri və oyunları üçün futbol meydançaları, qaçış yolları və tamaşaçılar üçün dairəvi tribunaları olan tikililər kompleksi. *Stadionda voleybol yarışları keçirilir.*

**STAXANOVÇU** *is.* [*rus. xüs. addan*] Yeni texniki vasitələri yaradıcı surətdə mənimsəmiş və sosializm yarışında adi istehsal normalarını çox-çox ötüb keçən qabaqcıl fəhlə (SSRİ-də 30-40-cı illərdə geniş yayılmış ad). [Reyhan] *kolxozun staxanovçu sağıcısı hesab olunurdu.* İ.Əfəndiyev. [Daşdəmir:] *Sən staxanovçu olub bir gündə on-on beş norma ödəyəndə, mən niyə miçurinçi olmayım?* M.Rzaquluzadə.

**STAJ** [*fr.*] 1. Hər hansı bir işin, fəaliyyətin davam etdiyi müddət. *Əmək stajı. İstehsalat stajı.* // Hər hansı ictimai təşkilatda olma müddəti. *Otuz illik stajı olan Murad* "*Yeni həyat*" *kolxozunda briqadir işləyir.* Ə.Vəliyev.

2. Tələbənin istehsalat təcrübəsi, yenicə işə başlamış şəxsin öz ixtisası üzrə təcrübə qazanması. *Təcrübə stajı keçmək.*

**STAJÇI** *is.* Praktik biliyini, iş təcrübəsini, ixtisasını artırmaq üçün bir idarə, ya müəssisəyə göndərilmiş mütəxəssis, fəhlə; təcrübəçi. *Stajçı çilingər.*

**STAJÇILIQ** b a x **stajorluq**.

**STAJKEÇƏN** *is.* Təcrübə keçən şəxs.

**STAJLI** *sif.* Stajı olan.

**STAJÓR** [*fr.* stagiaire] b a x **stajkeçən**.

**STAJORLUQ** *is.* Təcrübə keçmə; stajçılıq.

**STANDÁRT** [*ing.*] 1. Öz ölçüsünə, formasına, keyfiyyətinə görə tələbata cavab verən hər hansı bir şeyin nümunəsi. // Bir şeyin təşkilində, qurulmasında, hazırlanmasında, həyata keçirilməsində tətbiq edilən forma, eyni tip, eyni nümunə. *Standart hissə. Standart mebel.*

2. *məc.* Bir-birinə oxşayan, şablon, basmaqəlib, orijinallıqdan məhrum. *Standart sözlər. Standart ifadələr. Standart mövzular. Standart sual.*

**STANDARTLAŞDIRILMA** "Standartlaşdırılmaq"dan *f.is.*

**STANDARTLAŞDIRILMAQ** *məch.* Standart (1-ci mənada) hala gətirilmək, standart şəklə salınmaq.

**STANDARTLAŞDIRMA** 1. "Standartlaşdırmaq"dan *f.is.*

2. Bir şey üçün məcburi standartlar müəyyən etmə, birtipli formalar tətbiq etmə. *Detalları standartlaşdırma. Şriftləri standartlaşdırma. İnşaat işlərini standartlaşdırma.*

**STANDARTLAŞDIRMAQ** *f.* Hər hansı bir şey üçün standart (1-ci mənada) təyin etmək, standart şəklə salmaq. *Detalları standartlaşdırmaq. İstehsalı standartlaşdırmaq.*

**STANDARTLIQ** *is.* 1. Bir tipdə, bir ülgüdə, bir şəkildə olmaq; birtiplilik. *Məmulatların standartlığı. Ölçülərin standartlığı.*

2. *məc.* Şablonluq, basmaqəliblik, orijinallıqdan məhrumluq. *Sözlərin standartlığı. Çıxışların standartlığı.*

**STANİTSA** *is.* [*rus.*] Kənd tipli yaşayış məntəqəsi.

**STÁNSİYA** [*lat.* stansia – duracaq] 1. Müəyyən marşrut üzrə hərəkət edən dəmiryol qatarlarının və digər nəqliyyat vasitələrinin dayanacağı. *Metro stansiyası. Dəmiryol stansiyası. – ..Stansiyada izdiham çox idi. Sərnişinlər əldə bilet oturacaq yerlərini axtarırdılar.* T.Ş.Simurq. [Nuriyyə:] *Düşdüyüm stansiya balaca bir yer idi.* İ.Əfəndiyev.

2. Müəyyən əraziyə (hər hansı bir cəhətdən) xidmət edən və ya orada tədqiqat işi aparan xüsusi idarə, müəssisə. *Meteoroloji stansiya. Seleksiya stansiyası. Meşəqoruma stansiyası. Telefon stansiyası. – Stansiya yenicə yaradılmışdı və rayonda ən cavan MTS hesab olunurdu.* M.İbrahimov. *Kənddə*

*stansiya olandan bəri; Sular təslim olur, baş əyir ona.* Z.Xəlil. ◻ **Elektrik stansiyası** – başqa enerji növlərindən elektrik enerjisi istehsal edən müəssisə. *Gecənin bu vaxtı elektrik stansiyası həmişə işığı kəsirdi.* H.Seyidbəyli.

**STAPEL** *is.* [*holl.*] Tikilməkdə olan gəminin saxlandığı yer; tərsanə.

**STARŞİNÁ** [*rus.*] 1. Sovet Ordusunun kiçik komanda heyətində ən yüksək rütbə. *Rota starşinası. – Kəyan bölüyə tamaşa etməklə elə məşğuldu ki, starşinanın yaxınlaşıb batalyon komandiri ilə danışdığını eşitmədi.* Ə.Əbülhəsən.

2. Hərbi donanmanın kiçik komanda heyətində serjanta bərabər rütbə.

3. *köhn.* Kətxuda, yüzbaşı. *..Belə bir məsələ üçün kətxuda* [starşina] *hər iki məhəllədən adam çağırardı, vəkillər dəvət edərdi.* N.Nərimanov.

**START** [*ing.*] 1. Müəyyən məsafə üzrə idman yarışlarının başlanma momenti, vaxtı. ◻ **Start götürmək** – yarışda qaçışa, üzməyə və s.-yə başlamaq. // Uçucu aparatların havaya qalxma momenti, vaxtı. *Təyyarə starta hazırdır.*

2. Qaçış yarışında: yarışın başlandığı yer. *Estafet iştirakçılarının starta çıxışı.* // Uçuş aparatlarının havaya qalxdığı yer.

**STARTÇI** *is. idm.* Start (1-ci mənada) siqnalı verən hakim.

**STASİONÁR** [*lat.* stationarius] 1. Daim, həmişə bir yerdə olan, yerini dəyişməyən, bir yerdən başqa yerə köçməyən idarə, müəssisə və s. *Stasionar kitabxana. Stasionar xəstəxana. Stasionar kinoteatr.*

2. Ambulatoriyada deyil, xəstəxanada müalicə edilən. *Stasionar xəstə.* // Belə xəstələrə xidmət edən. *Stasionar həkim. Xəstəxanada stasionar şöbə.*

3. Sabit, yer dəyişməz, hərəkətsiz, həmişə bir yerdə olan, bir yerə bənd edilmiş. *Stasionar akkumulyator.*

**STATÍK** *sif.* [*yun.*] 1. Statikaya aid.

2. Sabit, hərəkətsiz, inkişafsız (*dinamik* ziddi).

**STÁTİKA** [*yun.* statos – duran, dayanan] 1. Mexanikanın, cisimlərin güc təsiri altında tarazlıq şərtlərindən bəhs edən bölməsi.

2. Sükunət, müvazinət halı (*dinamika* ziddi).

**STATÍST** [*yun.*] Səhnədə ikinci dərəcəli, sözsüz rolları oynayan, kütləvi səhnələrdə iştirak edən aktyor.

**STATÍSTİKA** [*lat.* status – vəziyyət] 1. İnsan cəmiyyətinin və xalq təsərrüfatının inkişafında kəmiyyət dəyişikliklərini öyrənən və bu sahədə əldə edilən məlumatı (rəqəmləri) elmi və praktik məqsədlər üçün işləyib hazırlamaqla məşğul olan elm.

2. Xalq təsərrüfatının, ictimai həyatın hər hansı bir sahəsində həmin elmin metodları ilə aparılan hesablama və bu hesablama nəticəsində alınan məlumat. *Dəmiryol statistikası. Kənd təsərrüfatının statistikası. Əhalinin statistikası.*

3. Bir sıra elmlərdə, əsasən dəqiq elmlərdə tətbiq edilən xüsusi tədqiqat üsulu. *Riyazi statistika. Dilçilik statistikası.*

**STATOR** *is.* [*lat.*] Maşınları və turbinləri hərəkətə gətirən mexanizm.

**STATUS** *is.* [*lat.*] Vətəndaşın, hüquqi şəxsin vəziyyəti.

**STELLAJ** *is.* [*alm.*] Bir şeyi dikinə qoyub saxlamaq üçün mebel, qəfəsə.

**STEND** [*ing.*] 1. Nümayiş etdirmək üçün üzərinə eksponatlar qoyulan lövhə, dəzgah, piştaxta. *Sərgi stendləri.*

2. *tex.* Maşınları quraşdırmaq və yoxlamaq üçün xüsusi qurğu, yer. *Sınaq stendi.*

3. *idm.* Sərrast atıcılıq sınaq və yarışları üçün xüsusi qurğuları olan meydança. *Ovçuluq stendi.*

**STENOQRAFÇI** *is.* Stenoqrafiya mütəxəssisi.

**STENOQRÁFİYA** [*yun.* stenos – sıx və grapho – yazıram] Ağızdan çıxan sözləri olduğu kimi xüsusi işarələr və ixtisarlarla cəld yazma üsulu.

**STENOQRAFLAMA** "Stenoqraflamaq"-dan *f.is.*

**STENOQRAFLAMAQ** *f.* Stenoqrafiya üsulu ilə yazmaq, stenoqrafiyasını götürmək.

**STEREOMÉTRİYA** [*yun.* stereos – məkan və metreo – ölçürəm] Həndəsənin, həndəsi fiqurların (xətt, cisim, səth) fəzada vəziyyətindən bəhs edən şöbəsi.

**STEREOSKÓP** [*yun.* stereos – məkan və skopeo – baxıram] Hər iki gözlə baxdıqda iki eyni şəkli bir şəkil kimi göstərən cihaz.

**STEREOTİ́P** [*yun*. stereos – bərk və typos – iz] *mətb*. Metal, rezin və s. lövhəcik üzərinə keçirilmiş mətbəə naboru surəti (çoxtirajlı və təkrar nəşr çap etmək üçün işlədilir).

**STERİ́L** *sif.* [*lat.*] Sterilizasiya yolu ilə mikroorqanizmləri məhv edilmiş, mikroblardan təmizlənmiş; mikrobsuz. *Steril bint. Steril xalat. Steril pambıq*.

**STERİLİZÁSİYA** [*lat.*] Suda qaynatma, filtrdən keçirmə və ya kimyəvi maddələrin təsirilə mikroorqanizmlərin məhv edilməsi; mikrobsuzlaşdırılma. *Südün sterilizasiyası. Cərrahi alətlərin sterilizasiyası*.

**STERİLİZÁTOR** [*lat.*] 1. Sterilizasiya üçün aparat, cihaz. *Şprislər üçün sterilizator.*

2. Sterilizasiya mütəxəssisi.

**STERİLİZƏ: sterilizə etmək** – b a x **sterilləşdirmək** 1-ci mənada. *Yeyinti məhsullarını sterilizə etmək. Konservləri sterilizə etmək.*

**STERİLLƏŞDİRMƏ** "Sterilləşdirmək"dən *f.is.*

**STERİLLƏŞDİRMƏK** *f.* 1. Mikrobsuzlaşdırmaq, mikroorqanizmləri məhv etmək, sterilizə etmək. *Konservləri sterilləşdirmək.*

2. Dölsüzləşdirmək, axtalamaq.

**STÉRLİNQ** [*ing.*] İngiltərə qızıl və gümüş pullarının qanuni standart meyarı.

**STİ́L** [*fr.* style] b a x **üslub**.

**STİLİ́STİKA** [*fr.,* əsli *yun.*] 1. Ədəbiyyat nəzəriyyəsinin, bədii əsərlərin dil xüsusiyyətlərini və ifadə vasitələrini öyrənən bölməsi; üslubiyyat.

2. Dilçilik elminin, dilin bədii ifadə vasitələrini öyrənməklə məşğul olan bölməsi.

**STİ́MUL** [*lat*. stimulus] Həvəs və maraq oyadıcı amil, vadaredici səbəb. *Əmək məhsuldarlığını yüksəldən stimul*.

**STİMULYÁTOR** [*lat.*] Bitkinin inkişafını və böyüməsini sürətləndirmək üçün tətbiq edilən kimyəvi maddə.

**STİMULLAŞDIRMA** "Stimullaşdırmaq"-dan *f.is.*

**STİMULLAŞDIRMAQ** *f.* Stimul yaratmaq, bir şeyin həyata keçməsini təzələşdirmək, gücləndirmək.

**STİROL** *is.* Paltar yumaq üçün sabunqələvi tozu.

**STOL** [*rus.*] 1. Miz, masa. *Uzunsov stol. Girdə stol. Yazı stolu. Cərrahiyyə stolu. – Zirzəminin ortasında palıd taxtasından iri bir stol qoyulmuşdu*. S.Rəhman. *Stolların üstünə yığılmış qəzet, jurnallar rütubətdən saralmışdı*. İ.Əfəndiyev.

2. *məc. dan.* Süfrə. *Stol açmaq. Yaxşı stol düzəltmək*. – [Səkinə Rüstəmə:] *Özün deyirsən ki, stol açacağam, qoyun kəsdirəcəyəm, düyü islatdıracağam.* M.İbrahimov.

3. Xüsusi bir işlə məşğul olan idarə və ya onun bir şöbəsi. *Adres stolu. Qeydiyyat stolu. Tapıntılar stolu*.

**STOLBAZ** [*rus.* стол və *fars.* ...baz] b a x **vəzifəpərəst**. [Dilşad:] *Bu, Cahangir kimi stolbazların .. düzəltdikləri fitnədir.* İ.Əfəndiyev.

**STOLÜSTÜ** *sif.* 1. Stol üstünə qoyulmaq üçün düzəldilmiş, stol üstünə qoyulan, yaxud stol üçün uyğunlaşdırılmış. *Stolüstü saat. Stolüstü oyunlar. Stolüstü tennis. – Hətəmov barmaqlarını stolüstü süfrəyə vuraraq düşünürdü.* B.Bayramov. *Stolüstü lampanın işığında, arxası üstə uzanmış Gülgəzin geniş açılmış gözləri parıldayırdı.* İ.Hüseynov.

2. *məc.* Həmişə lazım olduğuna görə daim stol üstündə saxlanılan, əl altında, yaxında olan (kitab, vəsait və s. haqqında). *Bu lüğət mənim stolüstü kitabımdır.*

**STOMATOLÓGİYA** [*yun.* stoma (stomatos) – ağız və loqos – elm] Tibbin ağız boşluğu, dişlər, çənə və onlara yaxın yerlərin xəstəliklərindən bəhs edən şöbəsi.

**STOMATOLOJİ́** *sif.* [*yun.*] Stomatologiya ilə bağlı olan, stomatologiyaya aid olan. *Stomatoloji klinika. Stomatoloji tədqiqat.*

**STOMATÓLOQ** [*yun.*] Stomatologiya mütəxəssisi.

**STRATÉGİYA** [*yun.* strategia – qoşun və ago – aparıram] 1. Geniş miqyasda hərbi əməliyyat, müharibə hazırlama və aparma sənəti. *Strategiya və taktika.* // Müharibə aparma elmi. *Strategiya haqqında leksiya. Strategiya kursu.* // Müharibə, hərbi əməliyyat planı.

2. *məc.* İctimai, siyasi mübarizəyə rəhbərlik etmək məharəti, bacarığı.

**STRATEJİ́** *sif.* [*yun.*] 1. Strategiya ilə bağlı olan, strategiyaya aid, strategiya tələblərinə

cavab verən, ümumi hərbi məqsədləri həyata keçirmək üçün əhəmiyyəti olan.

2. Hərbi əhəmiyyəti olan, müharibənin ümumi məqsədlərinin həyata keçirilməsi baxımından əhəmiyyəti olan. *Strateji xammal. Strateji tikintilər. Strateji ehtiyat qüvvələri. Cəbhənin strateji mərkəzi.* ◻ **Strateji aviasiya** – uzaq məsafələrdə əməliyyat aparmaq, uzaq məsafələri bombalamaq üçün aviasiya. **Strateji xammal** – müharibə üçün lazım olan materiallar.

3. *məc.* Siyasi, inqilabi mübarizənin hər hansı bir mərhələsində ümumi əsas məqsədlərin həyata keçirilməsi üçün çox böyük əhəmiyyəti olan. *Strateji plan. Strateji şüar.*

**STRATÉQ** [*yun.* strategos] Mahir sərkərdə, strategiyanı yaxşı bilən şəxs. // *məc. tənt.* İctimai, siyasi mübarizəyə rəhbərlik etməkdə böyük məharəti olan şəxs.

**STRATOSFÉR** [*lat.* stratum – döşəmə və *yun.* sphaira – kürə, şar] Atmosferin dəniz səthindən 9-11 km yüksəklikdə olan üst təbəqəsi.

**STRATOSTÁT** [*lat.*] Stratosferə qalxmaq üçün aerostat. *Stratostat qalxır boş ənginlərə; Rənglərə boyanan xoş ənginlərə.* N.Rəfibəyli.

**STREPTOKÓK** [*yun.* streptos – zəncir və kokkos – toxum] *tib.* İrinli iltihablar, qızılyel və s. xəstəliklər törədən, zəncir təşkil edən girdə bakteriya.

**STREPTOSÍD** [*yun.* streptos və *lat.* caedere – öldürmək] Streptokok xəstəliklərinin müalicəsində tətbiq edilən dərman. [İmanov] *..ağ və qırmızı streptosidi, kalseksi qayda ilə* [Tahirə] *içirdir, amma qızdırmanın düşmədiyini, əksinə, yavaş-yavaş qalxdığını görəndə daha da qanı qaralırdı.* M.Hüseyn.

**STRESS** [*ing.* stress – gərginlik] Xarici və ya daxili mühitin mənfi qeyri-spesifik amillərinin təsirinə cavab olaraq canlı orqanizmdə əmələ gələn spesifik fizioloji reaksiya.

**STRİXNÍN** [*yun.* strychnos] Hindqozu tropik bitkisi toxumlarından alınan, çox güclü zəhər (təbabətdə istifadə edilir). *Strixnin rəngsiz, dördkünclü kristal olub suda və efirdə pis, spirt və benzolda isə asan həll olur.* R.Əliyev.

**STRUKTURALÍST** Strukturalizm tərəfdarı.

**STRUKTURALÍZM** [*lat.* structura] Müasir dilçilik elmində dil vahidləri arasındakı daxili (struktur) əlaqələri dəqiq təsvir etmək üçün üsullar irəli sürən cərəyanlardan birinin adı.

**STUDİYA** [*ital.*] 1. Rəssam və ya heykəltəraş emalatxanası.

2. Artist, rəssam, heykəltəraş hazırlayan məktəb (bu məktəbdə keçirilən dərslər yaradıcı məşğələlərlə birgə aparılır). *İndi məktəbin səhnəsinə çıxıram, bu üzümüzə gələn ildə dram studiyasına yazılacağam.* S.Rəhimov.

3. B a x **kinostudiya**.

4. B a x **radiostudiya**.

**STUL** [*rus.*] Adətən bir nəfərin oturması üçün oturacağı və söykənəcəyi olan mebel növü; kürsü. *Ortada dayanıb danışan adam yaxın stulların birində oturdu.* S.Rəhman. *Zala şəhərdən gətirilmiş yumşaq stullar düzülmüşdü.* İ.Əfəndiyev.

**STÜARDÉSSA** [*ing.* stewardess] Təyyarədə sərnişinlərinə xidmət edən qadın.

**SU** *is.* 1. Dənizləri, gölləri, çayları, bulaqları əmələ gətirən və hidrogenlə oksigenin kimyəvi birləşməsindən ibarət olan şəffaf rəngsiz maye. *Yağış suyu. Çay suyu. İçməli su. – Stol üzərindəki qrafindən stəkana su töküb içdim.* A.Şaiq. // Müalicə məqsədilə işlədilən mədən suları. *Badamlı suyu. Borjom suyu.* // Cəm şəklində: **sular** – mədən suları çıxan yerlər, bu sularla müalicə olunan kurort yerləri. *Məktubundan belə görünür ki, yayda müalicə üçün sulara gedəcəksən.* S.S.Axundov. // *məc.* Boş, mənasız sözlər, ibarələr, ifadələr, danışıqlar, əsərlər haqqında. *Əsərdə su çoxdur. Kitabın yarısı sudur.*

2. Çayın, dənizin, gölün su kütləsi. *Su ilə əhatə olunmaq. Sudan keçmək.* // Çay, bulaq, axar su. [Kərəm:] *Su başında duran qızlar, gəlinlər; Allı gəlin, Xan əslimə bənzərsən.* "Əsli və Kərəm". *..Naməlsəm məhəlləsinin bir neçə cavanları daha artıq səbir edə bilməyib əllərində bel su başına getdilər.* N.Nərimanov. // *Cəm şəklində* – sular. Su sahələrinin, dənizlərin, göllərin, çayların bir hissəsi. *Dövlət suları. Territorial sular.*

3. *məc.* Tər mənasında. *Su içində gəlib çıxdıq. Uşaq su içindədir, paltarını dəyiş.*

4. Meyvədən, səbzəvatdan çıxarılan şirə. *Nar suyu. Kök suyu. Alma suyu. Portağal suyu.* // Bəzi ətirli bitkilərin yarpaq və çiçəklərindən distillə yolu ilə alınan ətirli maddə, maye. *Gül suyu. Nanə suyu.*

5. Xörəyin duru hissəsi. *Xörəyin suyunu çoxaltmaq. Düşbərənin suyu çox düşüb.*

◊ **Su(yunu) dəyişmək** – müalicə məqsədilə yaşadığı yerdən başqa yerə köçmək, ya getmək, iqlimini dəyişmək, havasını dəyişmək. **Su ilə od arasında qalmaq** – çaşbaş qalmaq, nə edəcəyini bilməmək, çaşmaq. **Su kimi** – rahat, rəvan, səlis; tez, incimədən, çətinlik çəkmədən. *Su kimi əzbərləmək. Su kimi cavab vermək.* – [Səriyyə Saraya:] [Müəllim] *dedi ki, iki ayda lap su kimi oxumaq öyrədəcəyəm.* Mir Cəlal. **Su kimi getmək** – tez xərclənib getmək (pul haqqında). **Sudan quru çıxmaq** – çətin, ağır vəziyyətdən qurtarmaq, heç bir ziyan, cəza görmədən yaxasını qurtarmaq. [Qurban:] *Elədir, bu haramzada sudan quru çıxacaq.* Ə.Məmmədxanlı. **Suyu bir yerdən axmamaq** – düz gəlməmək, bir-birinə öyrəşə bilməmək, yola getməmək (adətən ər-arvad haqqında). *Əmisi qızı ilə Cəmilin ər-arvadlığı cəmisi üç ay çəkdi. Onların suyu bir yerdən axmazdı, ulduzları barışmazdı.* Ə.Vəliyev. **Suyu bulandırmaq** – aranı qarışdırmaq, araya fitnə salmaq. [Muxtar anasına:] *Bunlar hamısı bəhanədir, suyu bulandırmaqdır.* B.Bayramov. **Suyu sovulmuş dəyirmana oxşamaq (dönmək)** – xaraba qalmaq, pis kökə düşmək, dağılmaq, işləməz hala gəlmək. [Qəndab:] *Çingizin yaşadığı otaq suyu sovulmuş dəyirmana dönmüşdü.* B.Bayramov. **Suyu süzülə-süzülə (süzələnə-süzələnə) getmək (qayıtmaq)** – kor-peşman, qanı qara, kefi pozulmuş halda, pərt. *Sınıq düşən Səlim bəy suyu süzələnə-süzələnə Gorusa qayıdıb, istər-istəməz Peterburqa bir də xəbər yazdı.* S.Rəhimov. **Suyu üfürə-üfürə içən** – çox ehtiyatlı, vasvası adam haqqında. [Zeynəb Leyliyə:] *Ölçüb-biçəndən, suyu üfürüb içəndən aşiq olmaz?* Ə.Məmmədxanlı. **Çox (nə qədər) su axmış** – illər keçmiş, çox vaxt keçmiş, xeyli ötmüş. *Bu illər ərzində nələr olmamışdı, nə qədər sular axmış, nə qədər adamlar həlak olmuş, torpağın üstündə nə qədər dəyişikliklər baş vermişdi.* M.İbrahimov. **Gözü su içməmək** – b a x **göz**. **Üzündə su yoxdur** – b a x **üz**. **Üstünə su ələnmək** – b a x **üst**.

**SUAXAN** *is.* Keçmişdə: çimmək üçün evlərin küncündə düzəldilən xüsusi yer. [Arvad] *qazanda su qoyub qızdırdıqdan sonra Kəbleyini suaxanda yuyundurub yatırdır.* H.Sarabski.

**SUAL** *is.* [*ər.*] 1. Bir şey haqqında cavab, məlumat almaq üçün müraciət etmə, soruşma; sorğu. *Sualla müraciət etmək. Suala cavab vermək. Suallar barədə fikirləşmək. – Gülsənəm arvadın sualındakı təəccüb nidası çox qüvvətli idi.* M.Hüseyn. □ **Sual vermək (etmək)** – soruşmaq. *Kitabı əlindən yerə qoyub, Sona Bahadırdan sual etdi..* N.Nərimanov. *Həyat nədir? Sual verdim özümə; Mənasını çiçəklərdən öyrəndim.* M.Müşfiq.

2. Məsələ, problem. *İndi* [Şükürün] *başında fikrini məşğul edən bir sual vardı.* S.Hüseyn.

**SUALBAZ** *sif.* [*ər.* sual və *fars.* ...baz] Yerli-yersiz sual verməyi sevən adam; sualçı. *Bu zaman həmən sualbaz Şirəliyə yaxınlaşdı.* S.Rəhman.

**SUAL-CAVAB** b a x **sorğu-sual**. *Sual-cavab başlandı. Sual-cavab uzun çəkdi. Sual-cavab zamanı. – Bu sual-cavabdan sonra tamam pərt olmuş "ovçu" çaşqın-çaşqın yan-yörəsinə göz gəzdirdi.* M.Rzaquluzadə. [Əliqulu:] *Sual-cavabdansa, mənə bir əlac tap..* S.Rəhman.

**SUALÇI** b a x **sualbaz**.

**SUALEDİCİ** *sif.* Sual ifadə edən; suallı. *Sualedici gözlər. Sualedici baxış. – Diqqətlə, sualedici nəzərlərlə Ulduzun gözlərinə baxan qoca qadının birdən dodaqları titrədi.* Ə.Məmmədxanlı. *..Cəlal sualedici bir nəzərlə* [ustaya] *baxdı.* S.Vəliyev.

**SUALLI** b a x **sualedici**. *Hacı Rəsul Tahirzadənin suallı baxışını görüb əllaməlik büruzə vermək istədi.* Mir Cəlal.

**SUALTI** *sif.* 1. Suyun altında olan, icra edilən, su səviyyəsindən aşağıda olan. *Sualtı daşlar. Sualtı axtarışlar. – Ara-sıra sualtı vulkanlar da püskürürdü.* M.Qaşqay. *Maşinist barkası sualtı qayalardan qoruya-qoruya irəliləyirdi.* M.Süleymanov. // Su altında yaşayan, su altında bitən. *Sualtı canlılar.*

2. Su altında hərəkət edən. *Sualtı mina. Sualtı gəmi.* // Su altında edilən, su altında görülən. *Sualtı işlər. Sualtı kinofilm çəkmə.*

**SUAŞIRAN** *is. tex.* Artıq suyun axıb getməsi üçün bəndin divarlarında düzəldilən hidrotexniki qurğu, deşik, pəncərə, boru və s.

**SUAŞIRI** *is.* Çayda suyun iti axdığı yer.

**SUAYIRICI** *is. coğr.* Çay hövzələrini, yəni suların axımını iki əks istiqamətə ayıran təpə, xətt. *Suayırıcıdan axan çaylar.*

**SUBASAN, SUBASAR** bax **çaybasar**. *Subasan çəmən. – Qoy yamyaşıl məxmər geysin hər biçənək, hər zəmi; Körpə ceyran düzə gəlsin subasarı görəndə.* S.Vurğun. *Göz qaralan tarlaları pambıqlar örtsün bu yaz! Qoruqlarda, subasarda qalmasın bir yer boyaz!* R.Rza.

**SUBAY** *sif.* Evlənməmiş. *Subay oğlan. Subay qız.*

**SUBAYLIQ** *is.* Subay olma, əri və ya arvadı olmama, subay adamın vəziyyəti. *Subaylıq sultanlıqdır*. (Ata. sözü). [İlyas:] *Əzizim, mən subaylıqda da xörəkdən, istirahətdən korluq çəkməmişəm*. Mir Cəlal.

**SUBAYSAYAĞI** *sif.* və *zərf* Subayda olduğu kimi, subay kimi. *Subaysayağı süfrə. Subaysayağı yaşamaq*.

**SUBSTÁNSİYA** [*lat.* substantia] *fəls.* Bütün əşya və hadisələrin ilk əsası, mahiyyəti, məğzi.

**SUBSTANTİVLƏŞMƏ** *is. dilç.* Digər nitq hissələrinin isim kateqoriyasına keçməsi; isimləşmə. *Sifətin substantivləşməsi.*

**SUBSTANTİVLƏŞMƏK** *f. dilç.* İsim kateqoriyasına keçmək; isimləşmək.

**SUBTROPİK** *sif.* Subtropik sahəyə aid, subtropikdə olan. *Subtropik iqlim*. *– Elə subtropik bitki yoxdur ki, Azərbaycanda yetişməsin.* İ.Əfəndiyev.

**SUBTRÓPİKLƏR** [*lat.* sub – alt və *yun.* tropikos] *cəm* Yer kürəsinin tropik qurşaqla mötədil qurşaq arasında aralıq vəziyyət tutan iki fiziki-coğrafi zona.

**SUBURAXICI** *is. tex.* Suyu su anbarından su kəmərlərinə, suvarma və ya gəmiçilik kanallarına buraxmaq üçün qurğu.

**SUBYÉKT** *is.* [*lat.* subjectum] 1. *fəls*. Xarici aləmi (obyekti) dərk edən və öz əməli fəaliyyətində, işində ona təsir edən şəxs. // Şəxs, şəxsiyyət, adam. *O subyekt kimdir? Bu subyekt mənə tanış gəlir.*

2. *hüq*. Müəyyən hüquq və vəzifələri olan şəxs və ya təşkilat, hüquq subyekti. *Cinayət subyekti* (*cinayət işləmiş və buna görə də cinayət məsuliyyəti daşıya bilən şəxs*).

3. Məntiqdə: haqqında bəhs olunan şey, haqqında mühakimə yürüdülən şey. *Mühakimə subyekti*.

4. *qram*. Mübtəda.

**SUBYEKTİV** *sif.* [*lat.*] Subyektə, şəxsə, şəxsiyyətə aid olan, onunla bağlı olan, ondan asılı olan. *Subyektiv səbəblər. Tarixdə subyektiv amil. İşin subyektiv tərəfi*. // Tək bir şəxsə (subyektə) aid olan, xas olan, ancaq onun fikirlərini, hissiyyatını, təəssüratını əks etdirən; şəxsi, fərdi. *Məsələyə subyektiv yanaşma. Bu sənin subyektiv fikrindir.* // Qərəzkar, qeyri-obyektiv. *Subyektiv olmaq.*

◊ **Subyektiv idealizm** *fəls*. – idealizmin əsas formalarından biri, subyektivizm (1-ci mənada).

**SUBYEKTİVÍST** *is.* Subyektivizm (1-ci mənada) tərəfdarı.

**SUBYEKTİVÍZM** [*lat.*] 1. Maddi aləmin obyektiv varlığını inkar edən idealist fəlsəfi cərəyan.

2. Burjua sosiologiyasında: cəmiyyətin inkişafının obyektiv qanunlara əsasən deyil, guya subyektiv amillərə, yəni ayrı-ayrı şəxslərin iradəsinə, səyinə əsasən inkişaf etdiyini iddia edən idealist cərəyan.

3. *kit.* Subyektivlik, bir şeyə məhdud subyektiv münasibət (*obyektivlik* ziddi). *Elmdə subyektivizmlə mübarizə.*

**SUBYEKTİVLİK** *is.* 1. Ancaq bir subyektə, şəxsə, fərdə aid olma; şəxsi, fərdi. *Görüşlərin subyektivliyi*.

2. Bir şeyə həddən artıq subyektiv münasibət, qeyri-obyektivlik. *Məsələnin həllində subyektivlik göstərmək.*

**SUCUQ** *is.* 1. İçərisinə fındıq, qoz, şabalıd və s. doldurulmuş kolbasa şəkilli şirniyyat növü. *İçində şabalıd, fındıqla üzüm; Qozlu sucuqlardan beş-altı düzüm.* H.K.Sanılı.

2. Bax **tərək**.

**SUÇ** *is. köhn.* Günah, təqsir. [Xəyyam:] *İçsə o, bir suçmu bizim içməmiz; Qorxusu yox, sən də gəl iç, ey əziz.* H.Cavid.

**SUÇƏKƏN** *is.* Suyu canına çəkən, hopduran kağız. // Suçəkən (suqurudan) kağız – b a x **suçəkən**.

**SUÇİÇƏYİ** *is. tib.* Yoluxucu uşaq xəstəliyi.

**SUÇİLƏYƏN** b a x **susəpən**. *..Mehtər əlində xəlbir, üzü samanlı; birinin əlində süpürgə, suçiləyən və Gülpəri də gəlirlər.* Ü.Hacıbəyov.

**SUÇLU** *sif. köhn.* Təqsiri, günahı olan; müqəssir.

**SUÇU** *is.* 1. Keçmişdə dalında və ya başqa bir vasitə ilə su daşıyıb əhaliyə satan adam. *Küçələrdə arabaçılar, suçular və qeyri qəsəbə əhli o yan-bu yana yeriməkdə idi.* S.M.Qənizadə. *Ucqarlara suçular su daşıyırdılar.* A.Şaiq.

2. Əkin, bağ və s.-ni suvaran adam. *Mayanın suçularla söhbəti xeyli çəkdi.* M.İbrahimov. *Suçular əkini dərin şırımla və sısqa axınla suvardılar.* Ə.Vəliyev.

**SUDAŞIYAN** *is.* 1. B a x **suçu** 1-ci mənada.

2. İçmək, sulamaq, işlətmək və s. üçün su aparan, su daşıyan maşın və s.

**SUDUR** b a x **suluq** 1-ci mənada. *Ayaqlarının altı yəqin sudur olmuşdur.* M.Hüseyn.

**SUDURLAMA** "Sudurlamaq"dan *f.is.*

**SUDURLAMAQ** *f.* Sudur əmələ gəlmək, suluqlamaq.

**SUF, SUFBALIĞI** *is. zool.* Xanı balığı fəsiləsindən qiymətli bir balıq.

**SUFƏRƏSİ** b a x **cüllüt**.

**SUFİ** *is.* [*ər.*] 1. Təsəvvüflə məşğul olan adam; mistik.

2. Dindən, dini göstərişlərdən əsla kənara çıxmayan adam; zahid.

**SUFLYÓR** [*fr.* souffleur] Artistlərə suflyorluq edən teatr işçisi. [Oqtay:] *Xaspolad, haydı, sən də get, suflyordan kitabı al, sözlərinə bax.* C.Cabbarlı. *Belə bir qənaət var ki, artist mütləqa suflyor altında getməlidir.* S.Rəhman.

**SUFLYORLUQ** *is.* Tamaşa zamanı aktyorlara rolların sözlərini yavaşcadan söyləmə. ◻ **Suflyorluq etmək** – tamaşa zamanı aktyorlara rollarının sözlərini demək.

**SUGÜLÜ** *is. bot.* Sulaq yerlərdə bitən, bəzi hallarda çiçək açan bitki.

**SUXARÍ** [*rus.* сухарь] Qurudulmuş çörək tikəsi. *Çörəyi suxarı eləmək. Suxarı qurutmaq.* // Quru peçenye növü. *Uşaqlar dinməz-söyləməz, xırpa-xırpla suxarı çeynəməyə başladılar.* Ə.Əbülhəsən.

**SUİ-İSTİFADƏ** [*ər.*]: **sui-istifadə etmək** – bir şeyin və ya bir adamın zərərinə işləmək. *Vəzifəsindən sui-istifadə etmək. Özünə olan etimaddan sui-istifadə etmək.* – [Məmmədxanla Yusifəli] *..bəzən uşaqları iki yerə bölüb, hərəsi dəstənin birinə başçı olardı, öz xanzadəliklərindən sui-istifadə edərək onları vuruşdurardılar.* P.Makulu. *Yataqxana müdiri Rəhim vəzifəsindən sui-istifadə edir.* M.Süleymanov.

**SUİ-QƏSD** *is.* [*ər.*] Birinin canına qəsd etmək, birini öldürmək və ya yaralamaq qəsdində olma. *Rənaya qarşı düzəldilən sui-qəsd Nizamini hər şeydən çox düşündürürdü.* M.S.Ordubadi.

**SUİ-QƏSDÇİ** *is.* Sui-qəsd edən, sui-qəsd hazırlayan. *Vəsiqələrdən ən əhəmiyyətlisi sui-qəsdçilərin ingilis konsuluna yazdığı məktub idi.* M.S.Ordubadi. [Yazgül Şeydaya:] *Kimdir sui-qəsdçi?* Ə.Məmmədxanlı.

**SUİLANI** *is. zool.* Bəzi zəhərsiz ilanların adı. [Lətifə:] *Bir də onu gördüm ki, bax, bu qolum yoğunluqda suilanı qılçama dolanıb, məni dartışdırır.* M.Hüseyn.

**SUİTİ** *is. zool.* Pərayaqlılar dəstəsindən dəniz heyvanı. *Yeraltı gözə-gözə dəlmələrdə suitiləri yaşayır, balalayır, törəyir və artırdı.* S.Rəhimov. *Orada-burada dənizdə baş qaldıran suitiləri qayığın yaxınlaşdığını gördükcə dərhal suya cumub yox olur, özlərindən sonra dairəvi izlər buraxırdılar.* M.Hüseyn.

**SUKEÇİRMƏYƏN, SUKEÇMƏZ** *sif.* Suyu özündən keçirməyən, su keçməyən, suyu buraxmayan. *Sukeçirməyən lay. Sukeçirməyən parça. Sukeçirməyən plaş.*

**SUKƏSƏN** b a x **suyaran**.

**SUQAMIŞI** *is. bot.* Sulaq yerlərdə bitən, yarpaqlarından ip, kağız, səbət və s. hazırlanan, gövdəsi bəzi mal-qara üçün qiymətli yem sayılan ot bitkisi.

**SUQARANQUŞU** *is. zool.* Qağayılar fəsiləsindən su quşu.

**SUQOZU** *is. bot.* Suda bitən ot bitkisi.

**SUQUZĞUNU** *is. zool.* İribaşlı, əlvantüklü, uzundimdikli su quşu.

**SULAQ** *is.* Durğun su, bataqlıq, bataq yer. // Suyun yığıldığı yer, gölməçə.

**SULAMA** "Sulamaq"dan *f.is.*

**SULAMAQ** *f.* 1. Sərinlik üçün su tökmək, su axıtmaq, su çiləmək, su səpmək. *Küçəni sulamaq. Meydançanı sulamaq. – Hüseynəli əmi həyəti sulamaqda idi.* M.S.Ordubadi. [Cəlil] *dükanın qabağını süpürüb sulayardı.* İ.Musabəyov. // Məc. mənada. *..Xəzri haradansa buludları qovub gətirmiş, Bakını şiddətli və qısa yağışla sulayandan sonra, birdən xırp kəsilmişdi.* M.Hüseyn.

2. B a x **suvarmaq**. [İlyas Adiləyə:] *Məndən başqa bir neçə oğlan uşağı da göl qırağında atını sulayırdı.* Ə.Məmmədxanlı.

3. Dibinə su tökmək, su vermək. *Ağacları sulamaq. Dibçəkləri sulamaq. – Südabə axşam sərini düşəndə balaca bağçasındakı qırmızı gülləri sulayıb çarhovuz daşının üstündə oturmuşdu.* M.İbrahimov.

4. Yumşaltmaq üçün su çiləmək. [Səriyyə:] *..Nazik ağ yuxadan bir neçəsini sulayıb qoydum.* İ.Əfəndiyev.

**SULANDIRMA** "Sulandırmaq"dan *f.is.*

**SULANDIRMAQ**: **ağzını sulandırmaq** – b a x **ağız**[1].

**SULANMA** "Sulanmaq"dan *f.is.*

**SULANMAQ** *f.* 1. B a x **suvarılmaq**. *Əkin sahələri sulanıb. – Bağçanın ortasında yenə də dördkünc bir çarhovuz vardı, ..bu hovuzdan bağça sulanırdı.* Ə.Əbülhəsən. *Ancaq əkilən ağacların bir qismi Mingəçevirin yandırıcı hərarətinə davam gətirə bilmir, vaxtında sulanmadıqda quruyurdu.* Ə.Sadıq.

2. Su səpilmək, su çilənmək. *Həyət sulandı. Küçə sulanıb. – Araz kimi bulannam; Bağça kimi sulannam.* (Bayatı). *Molla sulanıb süpürülmüş eyvanda, palazın üstündə namaz qılırdı.* P.Makulu.

3. Dəymək, yetişmək, sütülləşmək, su (şirə) salmaq. *Armudlar sulanıb. – Meyvə vaxtı şəhər uşaqları sərçə kimi bu ağaca dırmaşar, alçaq budaqlarda ənciri sulanmağa qoymazdılar.* Mir Cəlal. // Su salmaq, şirəsi çıxmağa başlamaq. *Kabab yavaş-yavaş sulanır bu an; Ağ lavaş qoyulub yaşıl süfrəyə.* H.Hüseynzadə.

4. *xüs.* Suya salıb çıxartmaq, su vurmaq (kürədən çıxmış qızğın metal haqqında). *Tiyəni sulamaq. Bıçağı sulamaq. – Atamın günəş altında qaralmış alnı, üzü və bütün bədəni kürədə döyülmüş və sulanmış* (f.sif.) *polad parçasına oxşayırdı.* M.İbrahimov. *Burada xəncərlər sulanır, itilənir, hər cür tüfənglər yoxlanır..* Mir Cəlal.

5. Yaşarmaq. *Anıb o günləri fikri dolandı; Sinəsi atlandı, gözü sulandı.* H.K.Sanılı. [Yarməmməd] *gözləri sulanıncaya qədər asqırdı.* M.İbrahimov.

◊ **Ağzı sulanmaq** – b a x **ağız**[1].

**SULAŞMA** "Sulaşmaq"dan *f.is.*

**SULAŞMAQ** *f.* 1. *qarş.* Bir-birinə su atmaq. [Uşaqlar] *bir-birilə ötüşərək, hay salıb gah üzür, gah batıb yox olur, birdən baş qaldırıb ikiəlli sulaşırdılar.* Mir Cəlal. *Bir ara dəhlizdən otağa, otaqdan mətbəxə qaça-qaça bu üç xoşbəxt adam nəşə ilə sulaşdılar, su qurtarandan sonra taxtabənddə üz-üzə durub, bir-birinə baxaraq gülüşməyə başladılar.* Ə.Əbülhəsən.

2. Su salmaq, su buraxmaq, sıyıqlaşmaq.

**SULEYLƏYİ** *is. zool.* Ayağıpərdəlilər sinfindən suda yaşayan bir quş.

**SULFÁT** [*lat.* sulfur – kükürd] *kim.* Kükürd turşusunun duzu.

**SULFAZOL** [*xar.*] Kokkların törətdiyi xəstəliklərin müalicəsində işlədilən dərman preparatı.

**SULFİDÍN** [*lat.* sulfur – kükürd] Kokkların törətdiyi xəstəliklərin müalicəsində tətbiq edilən dərman preparatı.

**SULFÍT** [*lat.* sulfur – kükürd] *kim.* Sulfit turşusunun duzu. *Sulfit natrium.*

**SULU** *sif.* 1. Tərkibində suyu, şirəsi çox olan; şirəli. *Sulu gilənar. Sulu üzüm. – Ağaclar gümrahdır, meyvələr sulu; Nə yarpaq, nə də bir ot saralmışdır.* S.Vurğun. // Tərkibində su olan. *Sulu karbon. Sulu mineral turşular. Sulu neft.*

2. İslaq, yaş, rütubətli, nəm. *Sulu torpaq. Sulu yer.* ☐ **Sulu qar** – tez əriyən, nəm halda olan qar. *Gözlə bir şey görmək mümkün deyildisə də, sulu qarla qarışıq narın yağış yağdığı hiss olunurdu.* M.Rzaquluzadə. *Sulu qar yağdıqca yer təkinə qədər islanır, elə bil köpüb şişirdi.* Ə.Əbülhəsən.

3. Duru. *Sulu xörək. Sulu xingal.*

**SULUF** b a x **darı**. *Çəltik xatirinə suluflar da su içir.* (Ata. sözü). *Azərbaycanın çəltik*

*tarlalarında olan əsas alaq otları iridənli darı, çəltik darısı, toyuq darısı adlanır. Bizim kəndlərdə bu cür alaq otuna suluf deyilir*. X.Axundov.

**SULUQ** *is.* 1. İçi maye ilə dolu qabarcıq; qabartı, uçuq. [Mahmud:] *Balta vurmaqdan qollarım düşdü, əllərim suluq-suluq qabar oldu.* Ə.Haqverdiyev. [Sitarənin] *əllərinin içi qabar-qabar olmuşdu. Bir yerdən isə suluq atmışdı*. Ə.Abbasquliyev.

2. *məh*. Qoyunun ilk südündən hazırlanan pendirəoxşar ağartı. *Güllü qarı uşaqların hərəsinə bir parça suluq verdi.* İ.Əfəndiyev.

**SULUQLAMA** "Suluqlamaq"dan *f.is.*

**SULUQLAMAQ** *f.* Suluq əmələ gəlmək, qabarlamaq. *..Üç qardaşın üçünün də əli üç dəfə qabar qoyub suluqladı*. S.Rəhimov. [Səməndər] *əlləri suluqlayana qədər günbəzin bünövrəsinə külüng çaldı*. B.Bayramov.

**SULUQLANMA** "Suluqlanmaq"dan *f.is.*

**SULUQLANMAQ** *f.* Suluq bağlamaq, suluqlar əmələ gəlmək, qabar olmaq. *Dar çəkmədən ayağı suluqlanıb.*

**SULULUQ** *is.* Sulu şeyin halı və keyfiyyəti; şirəlilik. *Meyvənin sululuğu*.

**SUMAĞI** *sif.* Sumaq rəngində, tünd-qırmızı. *Züleyxa gen, sumağı paltarda idi*. Ə.Əbülhəsən.

**SUMAQ** *is.* Yarpaqlarından aşı, boyaq və dərman maddələri hasil edilən ağac və ya kol. *Sumaq üç metrə qədər hündürlükdə, qışda yarpağı tökülən alçaqboylu ağac və ya koldur. Yaşıl-ağ rəngli çiçəkləri iyunda açır, tünd-qırmızı rəngli meyvəsi sentyabrda yetişir. Yarpağından dəri aşılamaqda geniş istifadə olunur*. H.Qədirov. // Həmin ağacın xörəklə yeyilən qurudulub döyülmüş tünd-qırmızı meyvəsi.

**SUMAQDAŞI** *is. geol.* Püskürmə, ya çöküntü süxurların quruluşunun dəyişməsi yolu ilə əmələ gəlmiş daş. *Eyvanın sütunları sumaqdaşından idi*. M.S.Ordubadi.

**SUMBATA** *is.* Şüşəni, metalı, daşı cilalamaq, parıldatmaq, hamarlamaq, habelə metaldan qayrılmış şeyləri sürtüb təmizləmək üçün narınlaşmış halda istifadə edilən mineral. // Üzərinə lay şəklində həmin mineral ovuntusu yapışdırılmış kağız, ya parça. *Sumbata kağızı.*

**SUMBATALAMA** "Sumbatalamaq"dan *f.is.*

**SUMBATALAMAQ** *f.* Sumbata çəkmək, sumbata ilə sürtüb cilalamaq, parıldatmaq, təmizləmək.

**SUMBATLI** *sif.* Görkəmli, yaraşıqlı, ləyaqətli. *Sumbatlı oğlan.*

**SUMKÁ** [*rus.*] Dəridən, parçadan və s. materialdan hazırlanmış, adətən tutacağı olan qadın çantası. *Sumkasında cürbəcür pomada, üzyağı var; Dillənir dindirməmiş gərəksiz bir saz kimi.* S.Rüstəm. [Səkinə Mayaya:] *Xoş gəlmisən, bala! Qədəmlərin xoş olsun! – deyib, noxudu rəngli balaca sumkasını əlindən aldı*. M.İbrahimov.

**SUNƏRGİZİ** *is. bot.* Nohurların, göllərin ətrafında bitən sarıçiçəkli ot-bitki.

**SUÖLÇƏN** *is.* Sərf olunan suyun miqdarını göstərən cihaz.

**SUP** [*rus.*] Şorba. *Sup gətirdilər, yoldaşlarının hamısı xörəyə məşğul idi, Nərimanın isə iştahası yox idi*. Mir Cəlal.

**SUPERFOSFÁT** [*lat.* super və phoros] Təbii fosfatlardan, apatit, fosforit və s.-dən alınan fosforlu gübrə.

**SUPƏRİSİ** *is.* Xalq əfsanələrində: suda yaşayan, dağınıq uzunsaçlı, balıqquyruqlu çılpaq qadın surətində təsəvvür olunan əfsanəvi vücud.

**SURƏ** *is.* [*ər.*] Quranın bölündüyü 114 fəsildən hər biri. *Səhər uşaq mollaxanaya gedər, Quranın axırıncı surəsini əzbərdən oxuyardı.* H.Sarabski. *Molla Əkbər tamam gecəni can verən Baxışoğlu Həsənin başı üstə oturub, təsbeh çevirib, yasin surəsini oxumaqla məşğul idi*. B.Talıblı.

**SURƏT** *is.* [*ər.*] 1. Zahiri görünüş, şəkil. *Surəti dəyişmək*. – [Yusif:] *On ildir ki, Şamdan ilə görüşməmişəm. İndi görək ki, surəti də təğyir tapıbdır.* N.Nərimanov. *Bədənnüma güzgüdə o; Baxıb görür surətini*. N.Rəfibəyli. // Üz, sifət, çöhrə, sima. *O saat sevgili anasının surəti* [Nurəddinin] *gözlərinin önündə durdu.* S.S.Axundov. *..Mehriban çobanın surəti gözləri önünə gəldikdə, Səmədin qəlbində nakam məhəbbətin yarası daha şiddətlə sızıldamağa başlamışdı*. İ.Hüseynov.

2. Şəkil, üsul, qayda, tərz. [Odabaşı:] *Bu məhəbbət onlar böyüdükcə təbəddülata uğrayıb axırda başqa bir surət aldı*. Ə.Haqverdiyev.

3. Bir şeyin əslindən eynilə köçürülmüş nüsxəsi, üz. *Protokolun surəti. Şəhadətnamənin surəti. – Gəldiyev əvvəl bu vərəqənin surətini çıxartdırdı.* Mir Cəlal. *Bu, Yusifin öz xahiş ilə .. azad olunması barədə əmrinin surəti idi.* B.Bayramov.

4. Yazıçının, rəssamın, artistin yaratdığı tip, obraz, xarakter. *Yeni insan surəti. Səhnə surətləri. – Gənc Baxşı Cabbarlının maraqlı surətlərindəndir.* M.Arif.

5. Şəkil, portret, təsvir. *İndi başına daş düşmüş müsəlman belə surətləri görüb dinindən dönəndə deyirlər:* “*dəli olub*”. Ə.Haqverdiyev.

6. *riyaz.* Kəsirdə: bölünən ədəd. *Kəsrin surəti.*

7. **“Surətdə”** – şəklində bir sıra sözlərlə işlənərək zərf birləşmələri düzəldilir; məs.: süni surətdə, narazı surətdə, belə olan surətdə, təcili surətdə, rəsmi surətdə və s.

◊ **Bu surətdə** – belə olduqda, bu halda. [Hacı Nuru şair:] *Bu surətdə mənim hünərimdən nə fayda hasil olacaq, mənim şerim nəyə məsrəfdir?* M.F.Axundzadə. **Bu surətlə** – bu qayda ilə, beləliklə. [Qızılquş balalarının] *anası bu surətlə balalarına ovçuluq öyrədər.* A.Şaiq. **O surətdə** – onda, o zaman, o halda. *Bu elçinin oğlan evinə gətirdiyi məlumat əlverişli olsa, .. o surətdə oğlanın ana və bacısı o evə rəsmi surətdə elçi gələcəklər.* R.Əfəndiyev.

**SURƏTPƏRƏST** *sif.* və *is.* [*ər.* surət və *fars.* ...pərəst] Gözəl surəti, zahiri gözəlliyi sevən, zahiri gözəlliyə aldanan (adam).

**SURĞUC** *is.* Asanlıqla əriyən və tez bərkiyən rəngli bərk qatran (və ya mum) (konvertləri möhürləmək, şüşələrin ağzını bərkitmək üçün işlədilir). *Qubernator əlini uzadıb dörd tərəfi surğucla möhürlənmiş* (f.sif.) *bir paket çıxartdı.* M.S.Ordubadi. *Katib güclə stolun gözündən qırmızı surğuc, spiçka və ağ saplı iynə çıxartdı.* S.Rəhimov.

**SURĞUCLAMA** “Surğuclamaq”dan *f.is.*

**SURĞUCLAMAQ** *f.* Surğuc vurmaq. *Konvertləri surğuclamaq. Bağlamanı surğuclamaq.*

**SURĞUCLU** *sif.* Surğuc vurulmuş, surğuclanmış, surğucu olan, surğucla möhürlənmiş. *Mühasib surğuclu konverti aldıqdan sonra çox maraqlanmışdı:* “*Açım, açmayım?*” *– deyə, çox düşünmüşdü.* S.Rəhimov.

**SURROQAT** *is.* [*lat.*] 1. Nəyisə qismən əvəz edə bilən qayırma (geydirmə) məhsul; bədəl.

2. Saxta şey.

**SURSAT** *is.* 1. B a x **azuqə**. [Qatırlara] *su tuluqları, asma manqal, cürbəcür sursat yüklənmişdi.* Çəmənzəminli. [Allahverdi İmamverdiyə:] *Dayan, mənim heybəmdə sursat var.* C.Cabbarlı.

2. Güllə, mərmi, patron və s. hərbi ləvazimat. *Gələn kimi bölüyə nə qədər döyüş sursatı lazımdısa almış, bölüyü sursatla təmin etmişdi.* Ə.Əbülhəsən. *Şəhərdə bütün əhalini ayağa qaldırmaq, düşmənin hərbi sursat və avadanlıq aparmasına yol verməmək lazım idi.* S.Vəliyev.

**SUSAMA** “Susamaq”dan *f.is.*

**SUSAMAQ** *f.* 1. Su içməyə şiddətli ehtiyac hiss etmək, özündə yanğı hiss etmək. *Bərk susamaq. Yayda adam tez-tez susayır. – Qəlbi sınmış, gözü dolmuş, pozulmuş; İstidən susamış, acmış, yorulmuş.* A.Səhhət. *Susamışdı atlılar; Hamı axtarırdı su.* M.Seyidzadə.

2. *məc.* Bir şeyin həsrətində, arzusunda olmaq. *Mənim namərd əmim onun nəyinə susadı?* Ə.Haqverdiyev. *Həqiqətə susayan tərlan könlündən üzr istəmişdi ki,* “*bu qəfəsdən mən səni əlbəttə azad eyləyərəm...*” Mir Cəlal.

**SUSAMURU** *is. zool.* Tünd-qonur rəngli qiymətli xəzi olan yırtıcı su heyvanı.

**SUSDURMA** “Susdurmaq”dan *f.is.*

**SUSDURMAQ** *icb.* 1. Susmağa, dinməməyə, səsini kəsməyə məcbur etmək. [Birinci rəqqasə:] *Dur, getmə, səadət quşu, bir dur; Bas bağrına məşuqini, susdur!* H.Cavid. *Məni susdursa zaman; Səni özüm sanaram; Səhər kimi oyansan; Günəş kimi yanaram.* N.Xəzri.

2. *məc.* Bir şeyi təzahür etməyə, üzə çıxmağa qoymamaq; boğmaq. *Kədərini susdurmaq.* – [Muradın] *kefini pozmamaq üçün marağımı susdurdum.* Çəmənzəminli.

**SUSDURULMA** “Susdurulmaq”dan *f.is.*

**SUSDURULMAQ** *məch.* Susmağa, səsini kəsməyə, dinməməyə məcbur edilmək. *Pulemyot şaqqıltısı eşidildi. Ancaq o, tezcə susduruldu.* S.Vəliyev.

**SUSEVƏN, SUSEVƏR** *sif.* Suda bitən, rütubət yerlərdə bitən, rütubətsevən, yaxud

suda yaşayan, suyu sevən. *Susevən bitkilər. Susevər heyvanlar.*

**SUSƏPƏN** *is.* Sulamaq, su çiləmək üçün lüləyinin başında xırda deşiklər olan vedrəşəkilli qab; suçiləyən. *Susəpənlə gülləri sulamaq. – Qızlar susəpənlə küçə suvarır; Sərvlər baş əyib xəyala varır.* S.Vurğun.

**SUSQUN** *zərf* Dinməz, susmuş (halda), sakit, dinməz-söyləməz. [Toğrul Elxana:] *Halbuki bu tərəfdə susqun oturub kimsəyə görünməyəcəyinə söz vermişdin.* C.Cabbarlı. *Onlar hər ikisi bir vaxt sevinclə getdikləri yolu bu dəfə susqun və fikirli bir halda çıxmağa başladılar.* Ə.Məmmədxanlı. *Sən, ey mənim xəyalımtək; Göy havanı dələn qartal! Qonub dağlar zirvəsinə; De, susqunsan nədən, qartal?* N.Xəzri.

**SUSQUNLUQ** *is.* Susma, danışmama, sükut etmə. *Kosanın susqunluğuna qarşı Sübhanverdizadə bağırdı.* S.Rəhimov. *İzdihamın susqunluğu yalnız bir neçə an sürdü.* M.Hüseyn.

**SUSMA** "Susmaq"dan *f.is.*

**SUSMAQ** *f.* 1. Dinməmək, danışmamaq, dinməz oturmaq, ağzını açıb bir söz deməmək. *Qaragün, xanın sarsıldığını, susduğunu görüb ürəkləndi.* M.Rzaquluzadə. *Bütün bu söhbət vaxtı Teymur bərk həyəcan keçirməsinə baxmayaraq susurdu.* H.Seyidbəyli. // Kəsmək, dayanmaq, daha səsi eşidilməmək, gəlməmək, kəsilmək (səs). *Quşlar susdu. Musiqi səsi bir anlıq susdu. – Çalğı susduqdan sonra Səlim öz badəsini qaldırdı.* M.İbrahimov. // Eyni mənada top, tüfəng və s. səsi haqqında. *Cəbhə susdu. Top səsləri susdu. Minaatanlar susdu.* // Məc. mənada. *..Ucalır bağçadan bülbülün səsi; Çay susur, əsməyir çəməndə yel də.* N.Xəzri. *Susurdu əsən külək, susurdu axan bulaq; Qəlbinin səslərini eşidirdi o ancaq.* B.Vahabzadə. // Cavab verməmək, səs verməmək. *Nə üçün susmusan, cavab vermirsən? Susub, özündən heç bir xəbər bildirmir.*

2. *məc.* Öz duyğusunu, hissini büruzə verməmək. *Zəhra susub dolduqca Həsənin şübhələri dərinləşirdi.* M.İbrahimov. *Məsum kişi bütün bu gözlənilməz şeylərə susur, səbir edirdi.* Mir Cəlal.

3. Əmr şəklində: **sus!** – danışma, dinmə, səsini kəs. [Hüseynqulu ağa Pəricahan xanıma:] *Sus! Tezliklə sənə göstərərəm ki, bu evin sahibi mənəm.* S.S.Axundov.

**SUSMAZ** *sif.* Susmayan, dayanmayan, ara verməyən (səs haqqında).

**SUSPENZİYA** *is.* [*lat.*] Maye dispersiya (ayrılma, səpilmə, parçalanma) mühitində yayılmış bərk hissəciklərdən (dispers fəzadan) ibarət dispers sistem.

**SUSTALMA** "Sustalmaq"dan *f.is.*

**SUSTALMAQ** b a x **süstləşmək**. [Qoca Baxşı:] *Sona havanın birinci yarısını oxumuşdu, birdən sustaldı, uzandı, susdu.* C.Cabbarlı. [Yoldaşımız:] *Yavaş-yavaş qulağıma tar-qaval səsləri də gəlməyə başladı. Əlim-ayağım sustaldı.* M.Rzaquluzadə.

**SUSUZ** *sif.* 1. *kim.* Tərkibində su olmayan. *Susuz efir. Susuz spirt.*

2. Suyu olmayan, suyu çəkilmiş. *Uşaqsız ev susuz dəyirman kimidir.* (Ata. sözü).

3. Quru, suyu qurumuş, quraq. *Susuz çöl. Susuz çay. Susuz bulaq. – Çobanlar Turutun susuz çölündə; Boğulub batırdı qəmin selində.* H.K.Sanılı. *Boğazın o tayında susuz ada qəsəbəsinin çıraqları xeyli seyrəkləşmişdi.* M.Süleymanov. // Sudan məhrum, su cəhətdən çətinlik çəkən. *Port-Səid şəhərinin bütün əhalisi susuzdu.* S.Vəliyev.

**SUSUZLAMA** "Susuzlamaq"dan *f.is.*

**SUSUZLAMAQ** b a x **susamaq** 1-ci mənada.

**SUSUZLUQ** *is.* 1. Ürəyi bərk su istəmə, su içmə ehtiyacı; yanğın. [Yaralı:] *Ay bala, susuzluqdan yandım.* Ə.Haqverdiyev. *Şirzad susuzluqdan dodağının quruduğunu hiss edib düşərgəyə tərəf yollandı.* M.İbrahimov. [Nuriyyə:] *Mən aclığa davamlıyam, susuzluğa yox.* İ.Əfəndiyev.

2. Quraqlıq, rütubətsizlik. [Tahir:] *Həmən kanal susuzluqdan yanan düzlərə can verəcək.* M.Hüseyn.

**SUSÜNBÜLÜ** *is. bot.* Uzunsaplaqlı, çiçəkli, ortayarpaqlı su bitkisi.

**SUTKÁ** [*rus.*] 24 saata bərabər vaxt ölçüsü, gecə və gündüzün davam etdiyi müddət; gün. *Düz yeri bir yupyumru şey qapır; Həm də deyir, sutkada bir fırlanır.* M.Ə.Sabir. [Qədir] *bir sutka ayaq üstə durdu.* Mir Cəlal.

**SUTUTAR** *is.* Sonradan istifadə etmək üçün su toplanılan yer, gölməçə. *Təbii sututarlar. Süni sututar.*

**SUVACAQ** *is.* Su bəndlərində suyu buraxmaq üçün qapağı olan deşik.

**SUVAQ** *is.* Binaların divarlarına, içinə və s.-yə çəkilən suvaşqan maddələrin qum və su ilə qatışığından ibarət tikinti məhlulu; mala. *Divara suvaq çəkmək.* // Binaların tavanında, iç və bayır divarlarında həmin məhlulun bərkimiş təbəqəsi; mala. *Divarlardan asılmış xəritələr .. olmasaydı, suvaqların töküldüyü zahirə çıxardı.* H.Nəzərli. *..Divarların suvağı xal-xal olmuş, yağışdan yuyulmuş kərpiclərin sarı samanı biz-biz çıxmışdı.* İ.Hüseynov.

**SUVAQÇI** *is.* Suvaq çəkən fəhlə, suvaq ustası; malaçı, malakeş. [Direktor:] *Bizə xarrat, suvaqçı lazımdır.* M.Hüseyn. *Otaqları boşaldın, yoldaşlar! – deyə, üst-başı müxtəlif rəngə boyanmış suvaqçılar, malakeşlər, rəngsazlar gəlirdi.* Mir Cəlal.

**SUVAQLAMA** "Suvaqlamaq"dan *f.is.*

**SUVAQLAMAQ** *f.* Suvaq çəkmək, mala çəkmək, malalamaq.

**SUVAQLI** *sif.* Suvaq çəkilmiş, suvağı olan; malalı. *Üz-üzə durmuşdur suvaqlı damlar; Hay verib, hay alır gümrah adamlar.* S.Vurğun. *Sahil. ..Suyun gümüş aynasında əks olunur; Ağ suvaqlı böyük bir bina.* O.Sarıvəlli.

**SUVAQSIZ** *sif.* Suvaq çəkilməmiş, suvağı olmayan; malasız. *Suvaqsız divarda qədim tüfənglər və qılınclar asılmışdı, rəflərdə pas basmış mis qablar üst-üstə yığılmışdı.* Çəmənzəminli.

**SUVAMA** "Suvamaq"dan *f.is.*

**SUVAMAQ** *f.* Suvaq çəkmək, malalamaq. *Çox çəkmədi ki, gəlinlər gəlib* [şairin] *daxmasını suvadılar.* Ə.Məmmədxanlı.

**SUVAND** b a x **əyə**[2]. *İlk əyələr* (*suvand*) *köpəkbalığının dərisindən hazırlanmışdır. Belə əyələrlə ağacı, hətta mərməri cilalamaq olurdu.*

**SUVANDLAMA** "Suvandlamaq"dan *f.is.*

**SUVANDLAMAQ** b a x **əyələmək**.

**SUVANMA** "Suvanmaq"dan *f.is.*

**SUVANMAQ** *məch.* Suvaq, mala çəkilmək; malalanmaq. *İndi də divarlar sementlə suvanır, körpüyə döşənəcək taxtaya mazut sürtülür, qaralmış, qalın pərdilər körpü salınan yerə yaxın çəkilib rahlanırdı.* Ə.Əbülhəsən. *Otaqların üstü palçıqla suvanmışdı.* B.Bayramov.

**SUVARMA** 1. "Suvarmaq"dan *f.is.*

2. Suvarmaqla bağlı olan, suvarmaya məxsus. *Suvarma sistemi. Suvarma kanalı. Suvarma qurğusu.*

**SUVARMAQ** *f.* 1. Süni vasitələrlə torpağı, yeri islatmaq, nəmləndirmək; sulamaq. *Ləkləri suvarmaq. Əkin yerlərini suvarmaq. – Hər suçunun cirəsi gündə bir hektar yeri suvarmaqdır.* Ə.Vəliyev. *Çəpərin kölgəsində yaşıl qalmış nar kollarının dibinə* [Səməd] *arx çəkdi, suvardı.* İ.Hüseynov. // Dibinə su tökmək. *Ağacları suvarmaq. – Hüseynəli əmi .. gülləri suvarırdı.* M.S.Ordubadi. *Ağ saçlı bir qadın əlində vedrə, köhnə mis dolça pomidor və xiyar tağlarını suvarırdı.* H.Seyidbəyli.

2. Su vermək, su içirtmək. *Qoyunları suvarmaq. Mal-qaranı suvarmaq. – Tağı əmi .. atları suvarmağa göndərəndə mənə də boz madyana minməyə izin verərdi.* S.S.Axundov. *..Xırman döyənlər öküzləri vəldən açıb suvarır, yemləyir, tövlələrdə, həyətlərdə rahatlayırdılar.* Ə.Abasov.

**SUVAŞQAN** *sif.* Yapışan, yapışqan. *Suvaşqan maddələr.*

**SUVAŞQANLIQ** *is.* Suvaşqan maddənin xassəsi. *Kitrənin suvaşqanlığı.*

**SUVAŞMA** "Suvaşmaq"dan *f.is.*

**SUVAŞMAQ** *f.* Yapışmaq (suvaşqan şey haqqında). *Yastı-yapalaq evlər, odu sönməyən ocaqlar, palçığı yapışqan ayağa suvaşan torpaq* [insana] *yüz qat əziz görünür.* M.İbrahimov. [Adil:] *O qədər yaxşı bişməmiş çörək xəmir kimi adamın əlinə, dişlərinə suvaşırdı.* B.Bayramov. // Məc. mənada. *Oğlan uşağı atasına suvaşıb qışqırıq qopardı.* M.İbrahimov. [Həbibə:] *Saqqız kimi suvaşan sən idin, mən?* Mir Cəlal.

**SUVAT** *is.* Çaydan, arxdan və s.-dən su götürülən, habelə malların su içdikləri dayaz yer. *İnəkləri suvata yönəltmək.* // Heyvanların su içməsi üçün içinə su doldurulan müxtəlif materiallardan düzəldilmiş qurğu.

**SUVENİR** *is.* [*fr.*] Yadigarlıq hədiyyə, yadigarlıq şeylər.

**SUVERÉN** *sif.* [*fr.* souverain] Beynəlxalq hüquqda: ali hakimiyyəti təmsil edən, öz döv-

lətinin daxili və xarici işlərində tamamilə müstəqil olan, başqa dövlətin hakimiyyətindən asılı olmayan. *Suveren dövlət.*

**SUVERENLİK** *is.* Müstəqillik, öz dövlətində hökmran olma, başqa dövlətlərdən asılı olmama; hakimiyyət hüququ. [Asiya ölkələri] *müstəqil milli xarici siyasətlərini davam etdirərək öz dövlət suverenliklərini xeyli möhkəmlətmiş və milli iqtisadiyyat yaratmaq yolunda çox irəliləmişlər.*

**SUYACAQ** *is.* Çimmək üçün daş və s. ilə axar suyun qarşısı tutulan yer; gölməçə. *Suyacaq qayırıb səndə yay günü; Nə qədər çimmişəm mən sərin-sərin.* B.Vahabzadə.

**SUYARAN** *is.* Gəmi burnunun suyu yaran hissəsi.

**SUYOLU** *is.* Binanın və s.-nin altında suyun axıb getməsi üçün balaca yol; arx. *Ev sahibi qapısını bağlamışdısa da, altındakı suyolunu açıq buraxmışdı.* S.Hüseyn.

**SUYUŞİRİN** *sif.* Gözə xoş gələn, yapışıqlı, yaraşıqlı, gözəşirin, qanışirin. *Suyuşirin qız. Suyuşirin uşaq.* – [Eyvaz] *suyuşirin, çevik bir oğlan idi.* B.Bayramov.

**SUYUŞİRİNLİK** *is.* Suyuşirin adamın xassəsi, yapışıqlılıq, qanışirinlilik.

**SUZANBAĞI** *is. bot.* Sulaq yerlərdə bitən çiçəkli su bitkisi. *Suzanbağı fəsiləsinin nümayəndələri durğun və ya yavaş axan sularda bitən qədim* (*relikt*) *bitkilərdir.* M.Qasımov.

**SÜBH** *is.* [*ər.*] Səhər erkən çağı, günün başlanğıcı, günün ilk saatları; səhər, sabah. *Sübh tezdən. Sübh saat beşdə. Sübh alaqaranlıqda. – Qurbanqulu çox işsevən bir cavan idi. Sübh hamı qonşularından ertə durub oduna, biçinə, alağa, xıra, bağa gedərdi.* T.Ş.Simurq. *..Sübhün əbədi aşiqləri olan boz torağaylar havalanıb səhər nəğmələrini oxuyur, bildirçinlər, turaclar səs-səsə verib doğacaq günəşi pişvaz edirdi.* M.Rzaquluzadə.

**SÜBH-ŞAM** [*ər.* sübh və *fars.* şam] *klas.* bax **səhər-axşam**.

**SÜBUT** *is.* [*ər.*] Hər hansı bir şeyin həqiqiliyini, düzlüyünü göstərən fakt, mülahizə, müddəa, dəlil. [Almaz:] [Kəndin ağalarının] *əlində sübut var.* C.Cabbarlı. *Müəllim hiss etdi ki, belə mühüm bir məsələni Telli kimi avam bir qadına qandırmaq üçün əsaslı dəlillər və sübutlar lazım gələcəkdir.* S.Hüseyn. □ **Sübut etmək (qılmaq)** – bir faktın olduğunu dəlillərlə birinə qəbul etdirmək, təsdiq etdirmək. *Yaqo .. Kassio ilə Dezdemonanın mabeynində məhz ülfət və məhəbbət olduğunu qisim-qisim dəlillər ilə ərəbə sübut qılır.* F.Köçərli. *Ovçu .. məharətini sübut etmək üçün ətrafa göz gəzdirdi.* H.Seyidbəyli. **Sübuta yetirmək** – sübut etmək. *..Mədəd bu saat həmdəm axtarırdı ki, Xanpəri haqqında ürəyini boşaltsın. Özünün haqlı olduğunu, Xanpərinin səhv etdiyini sübuta yetirsin.* Ə.Vəliyev.

**SÜBUTLU** *sif.* Sübutu, dəlili olan.

**SÜBUTSUZ** *sif.* Heç bir sübutu, dəlili olmayan, sübut edilə bilməyən. *Sübutsuz ittiham. Sübutsuz iddialar.*

**SÜBUTSUZLUQ** *is.* Heç bir dəlili, sübutu olmama, sübut edilə bilməyən şeyin halı.

**SÜD** *is.* 1. Balalarını yedirib bəsləmək üçün qadınların və məməli heyvanların məmələrindən gələn ağ, qidalı maye. *Uşağa süd vermək. Qoyun südü. İnək südü.* – [Səkinə:] *Vallah, döşümdə südüm quruyub.* H.Nəzərli. *Qərənfil bacı südü ağ qalaylı mis qazana boşaldaraq, həyətdə qaladığı ocağın üstünə qoydu.* İ.Əfəndiyev. □ **Süd vermək** – əmizdirmək (uşağı).

2. Bəzi bitkilərin ifraz etdiyi ağ maye.

◊ **Süd anası (nənəsi)** – körpəyə süd verən başqa qadın; dayə, tərbiyə edib böyüdən qadın. [Xarrat:] *Oradan da* [uşağı] *kənddə bir süd anasına* (*dayəyə*) *verdilər.* T.Ş.Simurq. **Süd dişi** – uşağın çıxartdığı ilk diş. *Təzə çıxan süd dişinə; Qəhqəhəli gülüşünə; Tırıp-tırıp yerişinə; Çox baxıb heyran olmuşam.* M.Dilbazi. **Süd gölünə düşmək** – rifah və səadət içərisində yaşamaq, həyatın bütün nemətlərindən faydalanmağa başlamaq. *Əhmədlə Məmməd çatdıqları gündən süd gölünə düşüblər.* S.Rəhimov. **Süd kimi** – 1) ağappaq, qar kimi. *Yer süd kimi dümağ, üfüqlər açıq, hava durğun idi.* Mir Cəlal; 2) aydın, təmiz. *Gecə süd kimi aydın idi, ağaclar hərəkətsiz dayanmışdı.* Ə.Məmmədxanlı. *Süd kimi aydınlıq bir gecə idi.* Ə.Vəliyev. **Süd qardaşı (bacısı)** – bir vaxtda bir ananın südünü əmən uşaqlardan hər biri. *Məzkur abxazlının süd qardaşı qabardalı Səfər bəy ona qonaq olur.* F.Köçərli. **Südüm halal olsun!** – ananın öz

övladının hərəkətindən məmnunluğunu bildirən ifadə. [Səlma:] *Südüm halal olsun, oğul! Qanpolad!* H.Cavid. **Anasının südü halal olsun!** – yaxşı, nəcib uşaq haqqında. **Halal süd əmmiş** – b a x **halal**. [Kərbəlayı:] *Doğrudan, arvad, bir halal süd əmmişini tapsa idin, yaxşı olardı.* Çəmənzəminli.

**SÜDAŞI** *is.* Südlüsıyıq, südlüaş.

**SÜDÇÜ** *is.* 1. Südsatan adam. *Oba içində gəzinirdim. O gün südçülərdən biri şəhərə çox tez qayıtmışdı.* A.Şaiq. [Əhməd:] *Bildim ki, görmüş olduğum gözəl qız südçü Fətəlinin qızı imiş.* T.Ş.Simurq.

2. Süd satılan. [Məmmədcəfər:] *Bax, qabağımızdakı südçü dükanını görürsənmi?* Qantəmir. *Tahirzadənin ilk işi o oldu ki, şərikli kəsdikləri şişəyin bütöv bir şaqqasını ayırıb südçü məhəlləsinə, Məsmənin evinə göndərdi.* Mir Cəlal.

**SÜDÇÜLÜK** *is.* 1. Südçünün işi, peşəsi. *Südçülük eləmək.*

2. Süd məhsulları hazırlama. *Südçülüyün inkişafı.*

**SÜDDAŞ** *sif.* Eyni anadan süd əmən uşaqlardan hər biri; süd qardaşı (bacısı).

**SÜDƏCƏR** *sif.* Bir-birinin dalınca doğulan. *Südəcər uşaqlar.* – [Pəri nənə:] [Hümmətin] *bir böyük külfəti vardır. Südəcər, əkiztay, cin çolpası kimi zılğa-zılğa bir-birinə qarışmışdı.* S.Rəhimov.

**SÜDƏMƏR** *sif.* 1. Döş əmən, süd əmən; körpə, çağa. [Ceyran:] *Qucağındakı südəmər uşağını nə etsin?* S.Hüseyn. ..[Fotoqraf] *südəmər uşaq tutan qadın gördükdə diksindi.* S.Vəliyev. // İs. mənasında. *Qocaların, cavanların, südəmərlərin; Üz-gözündən səhər kimi nurlar tökülür.* S.Vurğun.

2. *isteh.* Uşaq, körpə (təcrübəsiz mənasında). *Sarı Musa acığından titrəyirdi, çünki o bilirdi ki, sabah* "*Sarı Musanın tüfəngini gecə südəmər bir uşaq əlindən almışdır*" *– sözləri dillərdə dastan olacaqdı.* A.Şaiq. *Biz kimə arxalanıb turbin qazmasına keçəcəyik? Südəmər uşaqlaramı?* M.Hüseyn.

**SÜDXANA** *is.* 1. Süd məhsulları hazırlanan və saxlanılan yer, bina. *Heyvandarlıq fermalarında tikilən köməkçi binalar: yem sexi və ya yem mətbəxi, qüvvətli yemlər saxlamaq üçün anbarlar, tərəvəz anbarı, silos qülləsi* (*quyusu, xəndəyi*), *südxana və başqalarından ibarətdir.* "Qaramal".

2. Süd və süd məhsulları satılan mağaza, dükan. // Qəhvəxana.

**SÜDQABI, SÜDDAN** *is.* Süd tökmək üçün qab.

**SÜDLƏYƏN** *is. bot.* İçində süd kimi ağ maye olan bitki növü.

**SÜDLÜ** *sif.* 1. Yaxşı süd verən, südü çox olan. *Südlü inək. Südlü qoyun.*

2. Südlə bişirilmiş, südlə hazırlanmış, südlə qarışıq. *Südlü çay. Südlü qəhvə.*

**SÜDLÜAŞ** b a x **südlüplov**. *Aşpaz aşpazlığını artırıb, südlüaşa soğan doğrayır.* (Məsəl).

**SÜDLÜK** *is.* Süd vermək üçün yetişdirilən, südverən, sağmal. *Südlük cins.*

**SÜDLÜLÜK** *is.* Ev heyvanlarının bu və başqa miqdarda südvermə qabiliyyəti. *Heyvanların yüksək südlülüyü. Bu inək öz südlülüyü cəhətdən başqalarından fərqlənir.*

**SÜDLÜPLOV** *is.* Südlə hazırlanan plov; südlüaş. *Südlüplov yeyildikdən sonra süfrə yığılır.* H.Sarabski. [Ramazan] *nahar üçün hazırlanmış südlüplovu ləzzətlə yeyib, çay içir, radio ilə musiqiyə qulaq asırdı.* M.Hüseyn.

**SÜDLÜSIYIQ** *is.* Südlə düyüdən hazırlanan duru xörək; südaşı. *Nəriman əllərini yuyub otağa girəndə, anası onun qabağına bir boşqab südlüsıyıq qoydu.* M.İbrahimov. *Südlüsıyıq bişirmək üçün Susənbərin həyətdə qaladığı ocaq balaca ailəni öz başına yığdı.* B.Bayramov.

**SÜDSATAN** b a x **südçü**.

**SÜDUR** *sif.* [*ər.*] *köhn.* Zahir olma, hasil olma, çıxma, baş vermə.

**SÜDVERƏN** b a x **südlü** 1-ci mənada. *Südverən inək.*

**SÜDYOLU** b a x **kəhkəşan**.

**SÜFLƏ** *sif.* [*fars.*] *köhn.* Deşilmiş, dəlinmiş.

**SÜFRƏ** *is.* 1. Yemək stolunun üstünə, yaxud yerə salınan xüsusi parçadan tikilmiş örtük. *Kətan süfrə. Tikməli süfrə. Böyük süfrə.* – *..Kənizlər tut ağacının altında süfrə salmağa başladılar.* Çəmənzəminli. *Bir azdan sonra ortalığa süfrə döşəndi.* H.Nəzərli.

2. Yemək, xörək; süfrə üstünə qoyulan yeməklər. *Yaxşı süfrələri vardı. Zəngin süfrə düzəltmək. – Muxtar istəsə də, istəməsə də, Şahini süfrəyə dəvət etməli oldu.* B.Bayramov.

**SÜXUR** *is.* [*ər.* "səxr" söz. cəmi] Yer qabığının tərkib hissəsini təşkil edən, müəyyən dərəcədə sabit tərkibli mineral. *Vulkan süxurları. Dağ süxurları.* // Yer altından çıxarılan hər cür qiymətli mineral.

**SÜİTA** [*fr.*] Ümumi bədii qayə və ya proqram cəhətdən eyni olan bir neçə müstəqil hissədən ibarət musiqi əsəri. // Bir mövzu ətrafında birləşmiş bir neçə rəqsdən ibarət kompozisiya.

**SÜJÉT** [*fr.* sujet] 1. Ədəbiyyatda: əsərdə iştirak edən surətlərin xarakterlərini açıb göstərən və əsərin əsas konflikti ilə bağlı olan hadisələrin məcmusu; mövzu, məzmun. *Əsərin süjeti həyatdan alınmışdır. – Qüdrət arvadına romanın süjetini danışdı və son səhifələrini ucadan oxuyub, Lalənin də eyni dərəcədə həyəcanlandığını hiss elədi.* M.Hüseyn.

2. Təsviri incəsənətdə: təsvir obyekti.

**SÜKAN** *is.* [*ər.*] 1. Gəmidə, avtomobildə, təyyarədə və s.-də istənilən istiqamətə yönəlmək üçün hərəkəti idarə edən qurğu. *Gəmi sükanı. Avtomobilin sükanı. Velosiped sükanı. Kombaynın sükanı. – Kamal qəti bir hərəkətlə sükanı çəkdi.* M.Rzaquluzadə. [Kamil] *sükanı məharətlə idarə edirdi.* M.Süleymanov.

2. *məc.* Başçılıq, rəhbərlik, idarə vasitəsi. *Dövlət idarəsi sükanı.*

**SÜKANÇI** *is.* 1. Gəmidə sükanı idarə edən dənizçi.

2. *məc.* Rəhbər, başçı, idarə edən. [Almaz:] *Bir də, yoldaşlar, sovet sədri kənddə ictimai işlərin sükançısı olmalıdır.* C.Cabbarlı.

**SÜKUN** *is.* [*ər.*] *klas.* Sakitlik, asayiş, aram, iztirabsızlıq. *Qurd-quş dəxi girmiş aşiyanə; Çökmüş də ağır sükun cahanə.* A.Şaiq.

**SÜKUNƏT** *is.* [*ər.*] 1. Sakitlik, aram, asayiş, rahatlıq. *Yandıraram sükutu da, sükunəti də; Qəlbimi alovlandıran yaşamaq-yaratmaq gözüylə.* R.Rza. [Nuriyyə:] *Bu aydınlıq çöllərin mehriban sükunəti.. indi mənə anlaşılmaz bir təsəlli, məchul bir ümid təlqin edirdi.* İ.Əfəndiyev. *O, sükunət içində ömrünü başa vurdu.* B.Vahabzadə. ◻ **Sükunət etmək** – 1) aram tutmaq, sakit olmaq; 2) sakin olmaq. *Otellonun əsli ərəbdir, Afrika qitəsinin şimal səmtində sükunət edən Marokko tayfasındandır.* F.Köçərli.

2. *xüs.* Durğunluq. *Cismin sükunət halı.*

**SÜKUT** *is.* [*ər.*] 1. Susma, danışmama, dinməmə. // Sakitlik. *Bir qədər sükutdan sonra Tahir söhbətin mövzusunu dəyişdi..* M.Hüseyn. *Gör nələr danışır o qərib sükut; Bəli, sükutun da öz dili vardır.* N.Xəzri. ◻ **Sükut etmək** – dinməmək, danışmamaq, susmaq. *Heç yazmayım, dedim, istəyim söndü; Qələm sükut etdi, könlüm düşündü.* Ə.Cavad. *Bəxtiyar-bəxtiyar açılar səhər; Dünya sükut edib səni dinləyər; Sən danışanda.* N.Xəzri. **Sükuta dalmaq (batmaq), sükuta qərq olmaq** – b a x **sükut etmək**. *Dostlar .. gözlərini bir-birinə zilləyib, sükuta daldılar.* M.Hüseyn. *Birdən-birə aləm sükuta dalır.* Mir Cəlal. *Sevgisiz, yoldaşsız bir gözəl kimi; Sükuta qərq olub yaşardın, əlbət.* M.Dilbazi. **Sükuta getmək** – bir müddət danışmamaq, dinməmək, səsini çıxarmamaq. *Cənnətəlinin .. məzəli hoppanmalarının bəxş etdiyi təsir sayəsində cavanlar bir müddət sükuta getdilər.* Çəmənzəminli. **Sükutu pozmaq** – danışmağa başlamaq, sakitliyi pozmaq. *Kənarda dayanıb deyilənlərə qulaq asan Mürsəl sükutu pozdu.* Ə.Vəliyev. *Müəllim sükutu pozdu.* S.Vəliyev.

2. Aram, rahatlıq. *Dilbər, sən gedəndən bəri könlümün; Nə səbri, sükutu, nə qərarı var.* Q.Zakir.

**SÜQUT** *is.* [*ər.*] Düşmə, aşağı enmə, yıxılma, dağılma. *Təhkimçilik üsulunun süqutu. Roma imperiyasının süqutu. – Bu şadlıq gecəsində Eldəniz xanədanının süqutuna əsas qoyuldu və hökmdarlara qarşı .. sui-qəsdin müqəddiməsi başlandı.* M.S.Ordubadi. ◻ **Süqut etmək** – yıxılmaq, dağılmaq, düşmək, məhv olmaq. *Ənisə çox yaxşı bilirdi ki, ər evinə getməklə istər özünün, istər atası Məşədi Əhmədin maddi həyatı qismən yoluna düşə bilər. Fəqət mənəviyyatca özü süqut edəcəkdi.* S.Hüseyn.

**SÜLALƏ** *is.* [*ər.*] Qohumluq və varislik hüququna əsasən taxtda ardıcıl surətdə bir-birini əvəz edən, eyni soydan olan padşahlar, hökmdarlar sırası. *Səfəvi sülaləsi. Şirvanşahlar sülaləsi.*

**SÜLB¹** *is.* [*ər.*] *köhn.* Sülalə, nəsil.

**SÜLB²** *sif.* [*fars.*] *köhn.* 1. Bərk, sərt, qatı.

2. Hissiz, heç nədən təsirlənməyən.

**SÜLEYMANİ** *is.* [*ər.*] Güclü zəhər; dezinfeksiya vasitəsi kimi boya istehsalında və s.-də işlədilən ağ toz.

**SÜLƏNMƏ** "Sülənmək"dən *f.is.*

**SÜLƏNMƏK** *f.* Daima yemək ardınca düşmək, yemək axtarmaq, yemək olan yerə getmək; sümsünmək (əsasən it haqqında, ya da təhqir, söyüş mənasında adam haqqında). [Mayor:] *Sən Məhəmməd yüzbaşının oğlu deyilsənmi ki, mənim qapımda dünənəcən sülənirdin?* N.Vəzirov. [Şeyda qarovulçuya:] *De görüm, gecə sümsük it kimi harada sülənirdin? Hanı bu taxtalar?* A.Şaiq.

**SÜLH** *is.* [*ər.*] 1. Barış, əmin-amanlıq, dinclik, sakitlik. *Sülh uğrunda mübarizə.* – *..Silahını bağrına basmış döyüşçülərin gözündə əbədi sülhün işıqları yanırdı.* M.İbrahimov. // Müharibə edən tərəflərin müharibəni dayandırmaq haqqında razılığı; saziş, barış, barışıq. ◻ **Sülh etmək** – barışmaq, barışmaq haqqında müşahidə bağlamaq.

2. İncikliyi, ədavəti, küsülülüyü aradan qaldırma, barışma. *Yox, kərbəlayıya hirs qalib olub, sülhlə arası yoxdur.* Çəmənzəminli. [Molla Xəlil] *qalibiyyətinə xatircəm deyildi. Bunun üçün müəllimə sülh təklif edirdi.* S.Hüseyn.

**SÜLHPƏRVƏR** *sif.* [*ər.* sülh və *fars.* ...pərvər] bax **sülhsevər**. [Bağır xan:] *Biz düşmənin sülh təklifini qəbul etməklə, sülhpərvər dünyanın məhəbbətini daha artıq qazana bilərik.* M.S.Ordubadi.

**SÜLHSEVƏR** *sif.* və *is.* Sülh tərəfdarı, xalqlar arasında sülh olmasını istəyən (adam), sülhpərvər. *Sülhsevər siyasət. Sülhsevər dövlət.*

**SÜLÜGƏN** *is.* Tərkibində qurğuşun olan mineral. // Qırmızı-narıncı və ya qırmızı-qəhvəyi rəngində boya.

**SÜLÜK** *is.* Baldırı koğuş bitkilərin (qarğının və s.-nin) təzə göyərmiş gövdəsi. *Qarğı sülüyü. Qanqal sülüyü.* – *Göy soğan su içəndən sonra sülük* (sif.) *qarğı kimi dayanmışdı.* B.Bayramov.

**SÜMSÜ** *is.* Quşları aldadıb tutmaq üçün onların səsini yamsılayan ovçu aləti. [Kərim baba:] *Sümsü quş kimi oxuyur, bununla qızılbaş balası tutarlar, – dedi.* A.Şaiq. // Ümumiyyətlə, qarğıdan qayrılan primitiv çalğı aləti; tütək. *Beləliklə, insanlar sümsü, tütək kimi musiqi alətlərini icad etmişlər.* Ə.Bədəlbəyli.

**SÜMSÜK** *sif.* Daim sülənən, sümsünən (it haqqında, çox vaxt söyüş, təhqir mənasında işlənir). *Faşizm qısqırdaraq sümsük itləri; Dalayır, talayır məmləkətləri.* M.Müşfiq. [Şamxal:] *Sənə neçə dəfə demişəm ki, bizim bu it sümsüyün biridi, qabağına bir tikə şey atan kimi aldanandı.* İ.Əfəndiyev.

**SÜMSÜNMƏ** "Sümsünmək"dən *f.is.*

**SÜMSÜNMƏK** *f.* Qapıları gəzib dilənmək, əl açmaq, yemək aramaq (çox vaxt təhqir, söyüş kimi işlənir). *İt itliyini tərgidər, sümsünməyini tərgitməz.* (Ata. sözü). [Hacı:] *Bu donuz harada sümsünür? – deyə sordu.* A.Şaiq.

**SÜMÜK** *is.* 1. İnsan və onurğalı heyvan skeletinin ayrı-ayrı tərkib hissəsi. *Qol sümüyü. Baldır sümüyü.* – [İmanqulunun] *bədəni elə tərpənirdi ki, elə bil heç sümüyü yox idi.* Çəmənzəminli. [Məsmə] *özünü bərkə verən kimi kürəklərindən ağrı qopur, damarları gizildəyir, sümükləri sancırdı.* Mir Cəlal.

2. Müxtəlif şeylər qayırmaq üçün istifadə edilən bəzi heyvanların (fil, suiti) dişi, yaxud buna oxşar başqa bərk cisim. *Qarmona sümük dil salmaq. Fil sümüyündən hazırlanan sancaq.* – *Tahir sümük çərçivəli eynək taxmış ucaboy, buğdayısifət, qıvrımsaç alimi yaxşı xatırlayırdı.* M.Hüseyn. [Fərrux] *siqareti ağ sümük müştüyə keçirib yandırdı və tüstülətməyə başladı.* B.Bayramov. // Sümükdən qayrılmış. *Sümük daraq. Sümük dəstək.*

3. Zər (nərd və s. oyunlarda). ◻ **Sümük atmaq** – nərd oynamaq. *Bəzən də yuxudan yarımçıq qalxıb; Aylı gecələrdə sümük atardıq.* S.Vurğun.

◊ **Sümük sındırmaq** – çox əziyyət çəkmək, çalışmaq; can qoymaq. *Elmi təhsil etmək lazımdır, sümük sındırmaq lazımdır.* C.Məmmədquluzadə. [Fərhad:] *Bu sözləri buyurursan, amma məgər mən bundan ötrü sümük sındırmışam?!* Ə.Haqverdiyev. **Sümük sındırmış** – təcrübəli; can qoymuş. *O isə belə işlərdə sümük sındırmış adamdır.* "Kirpi". **Sümükləri çıxmaq** – çox arıqlamaq. **Sümükləri çıxmış** – çox arıqlamış. *Arvad sümükləri çıxmış əli ilə* [Südabənin] *ətir qoxusu verən qara saçlarını, başını oxşadı.* M.İbrahimov. **Sümükləri çürümək** – tamamilə məhv olmaq, nişanı, izi-tozu qalmamaq. **Sümüklərini qırmaq (sındırmaq)** – bərk döymək, əzişdirmək. **Sümüyünə (sü-**

**müklərinə) düşmək (oyun havası haqqında)** – xoşu gəlmək, oynamağa həvəsləndirmək, sövq etmək. *Bu oyun havası adamın sümüyünə düşür.* **Sümüyünə qədər işləmək** – çox dərin təsir etmək. *Şiddətli külək, sən hər yerdə amansızsan! Sən soyuq şaxtadan da pissən, sən insanın sümüyünə işləyirsən!* S.Vəliyev. **Ağzına sümük atmaq** – susdurmaq üçün bir şey vermək. **Bir dəri, bir sümük** – b a x **dəri**. *Karl bir dəri, bir sümük olmuşdu*. Ə.Əbülhəsən.

**SÜMÜKALTI** *sif. anat.* Sümüyün altında olan.

**SÜMÜKARASI** *sif. anat.* Sümüklərin arasında olan.

**SÜMÜKLƏŞMƏ** "Sümükləşmək"dən *f.is.*

**SÜMÜKLƏŞMƏK** *f.* Bərkimək, qurumaq, sümük kimi olmaq. *Çörək qalıb sümükləşib*.

**SÜMÜKLÜ** *sif.* 1. Sümüyü olan. *Sümüklü ət.*

2. Sümükləri çıxmış, sümükləri bilinən. *Sümüklü əl.*

3. *məc.* Boylu-buxunlu, şaqqalı, sümükləri iri. *Natiqin bir suyu Veysə oxşayırdı. Ancaq bu ondan cavan, boylu, özü də sümüklü adamdı.* Ə.Əbülhəsən.

**SÜMÜKSÜZ** *sif.* Sümüyü olmayan. *Sümüksüz ət. Sümüksüz heyvanlar*.

◊ **Sümüksüz dil** – danışığını bilməyən, ağzına gələni danışan, danışdığı sözlərə fikir verməyən adam haqqında.

**SÜMÜKÜSTLÜYÜ** *is. anat.* Sümüyü örtən birləşdirici toxumalardan ibarət nazik qişa.

**SÜMÜKVARİ** *sif.* Sümük kimi, sümüyə oxşar.

**SÜMÜRGƏ** *is. bot.* Sümürgən fəsiləsindən iki ləpəli, bir, iki və çoxillik ot, az halda yarımkol, kol, ağac və sarmaşıq bitkisi.

**SÜMÜRMƏ** "Sümürmək"dən *f.is.*

**SÜMÜRMƏK** *f.* 1. Ağız və dodaqları ilə bir şeyi sorub çəkmək: əmmək. *Suyu sümürmək. Papirosu sümürmək. – Cümşüd bəy qəlyanı hərdənbir sümürüb qəhvəni qarışdırır və qurtum-qurtum içib söhbətə qulaq asırdı*. E.Sultanov. *Qarı bu suala diqqətlə qulaq asıb çubuğunu sümürdü..* S.Rəhman.

2. *məc.* Aldadaraq, dilə tutaraq birinin var-yoxunu sorub çəkmək, soymaq.

◊ **Qanını sümürmək** – b a x **qanını sormaq** ("**qan**"da). [Şeyda:] *Təbii, o sizin qanınızı sorub sümürmək istər*. H.Cavid. [Qarakişi Hümmətə:] *..Taxtabiti kimi kolxozun qanını sümürdün, indi də bizim üstümüzə yıxırsan?!* B.Bayramov.

**SÜNBƏ** *is.* Odlu silahların lüləsinin içini təmizləmək, yağlamaq, habelə bir şeyi bir yerə təpmək və ya çıxarmaq üçün uzun dəmir mil. *Tüfəng sünbəsi*. – [Məşədi:] *Bu sünbə nəinki tamam artıqdır, hətta arşından iki verşok da azdır.* Ə.Haqverdiyev. [Ovçu] *sonra sünbəni bayırdan tutub gördü ki, lülənin dibindən aralı durur*. M.Rzaquluzadə.

**SÜNBƏKİ: sünbəki getmək (vurmaq)** – danışmağa başlarkən sözü tələffüz etməkdə çətinlik çəkməkdən, kəkələməkdən ibarət nitq nöqsanı.

**SÜNBƏLƏMƏ** "Sünbələmək"dən *f.is.*

**SÜNBƏLƏMƏK** *f.* Sünbə ilə təmizləmək (tüfəngin və s.-nin lüləsinin içini).

**SÜNBÜL** *is.* 1. Taxıl bitkilərinin gövdəsinin başında dənlərin yerləşdiyi hissə. *Dənli sünbül başını aşağı salar*. (Məsəl). *Taxıllar boy atmış və sünbül bağlamağa başlamışdı*. Ə.Sadıq. *Sənəmin başı sünbüllərin arasına əyilmişdi.* Ə.Əbülhəsən.

2. Salxım şəklində ətirli çiçəkləri olan bir bitki. *Süsəndən, sünbüldən, lalə, nərgizdən; Siyah tellərinə düz, qadan alım!* Aşıq Ələsgər.

**SÜNBÜLÇİÇƏK** *is. bot.* Uzunsov yarpaqları və ətirli çiçəkləri olan dekorativ ot bitkisi.

**SÜNBÜLQIRAN** *is. zool.* Tarlaya, taxıla ziyan vuran siçanaoxşar gəmirici.

**SÜNBÜLLƏNMƏ** "Sünbüllənmək"dən *f.is.*

**SÜNBÜLLƏNMƏK** *f.* Sünbül bağlamaq, sünbül əmələ gəlmək. *Taxıl sünbüllənib*.

**SÜNBÜLLƏŞMƏ** "Sünbülləşmək"dən *f.is.*

**SÜNBÜLLƏŞMƏK** *f.* Sünbül halına gəlmək, sünbül bağlamaq; sünbüllənmək. *Səməd .. sünbülləşməmişdən yanıb qaralmış zəmilərə, uzaqdan görünən kimsəsiz tarlalara baxdıqca ürəyi sıxılırdı*. İ.Hüseynov.

**SÜNBÜLLÜ** *sif.* Çox sünbül olan, iri sünbüllü. *Qurban olsun canımız; Bu sünbüllü çöllərə; Bu mehriban ellərə.* S.Vurğun.

**SÜNG** *is.* [*fars.*]: **süng eləmək** – bütünlükdə var-yoxunu əlindən çıxarmaq, yox etmək, dağıtmaq, yoxa çıxarmaq, müflis etmək. **Süng olmaq** – var-yoxu əlindən çıxmaq, yoxa çıxmaq, yox olmaq, müflis olmaq. **Süngə çəkmək** – b a x **süng eləmək**. [Nəbi:] *Cəbi,*

*sən öləsən, bu gecə ağan Mehdi bəyi tamam süngə çəkiblər*. S.S.Axundov.

**SÜNGƏR** *is. zool.* 1. Dənizdə yaşayan ibtidai, çoxhüceyrəli, bitkiyəoxşar heyvan tipi. *..Bitki və heyvanların ibtidai formaları arasında kəskin sərhəd qoymaq lazım deyildir. Məsələn, süngər, polip, mərcan və s. bu kimi heyvanlar bitki kimi bir yerə yapışaraq yaşayır.* M.Qasımov.

2. Bu heyvanların, suyu asanlıqla canına çəkən və yuyunmaq üçün istifadə edilən bəzi növlərinin yumşaq, məsaməli gövdəsi. // Təbii süngərə oxşayan məsaməli, elastik rezin məmulat.

**SÜNGƏRDAŞI** *is.* Cilalama, taraşlama işlərində və s.-də istifadə edilən süngər kimi məsaməli, çox yüngül vulkanik süxur; dabandaşı, pemza.

**SÜNGÜ** *is.* Tüfəng lüləsinin başına taxılan ucuşiş silah. *Süngü ilə vuruşma. Süngü davası. – Sən süngünlə, dırnağınla yer altına yol açırsan; Sən qaranlıq gecələrə gözlərindən nur saçırsan*. S.Vurğun. *Lakin bir azdan sonra düşmən süngü zərbinə dözməyərək çəkildi*. Ə.Əbülhəsən.

**SÜNGÜLƏMƏ** "Süngüləmək"dən *f.is.*

**SÜNGÜLƏMƏK** *f.* Süngü ilə vurmaq, süngü batırmaq. *Dənizdə parlayan elektrik işıqları onu süngüləmək istəyən bir dəstə çar soldatını xatırlatdı.* M.S.Ordubadi.

**SÜNGÜLƏŞMƏ** 1. "Süngüləşmək"dən *f.is.*

2. Süngü davası.

**SÜNGÜLƏŞMƏK** *qarş.* Bir-birini süngü ilə vurmaq, süngüləmək.

**SÜNGÜLÜ** *sif.* Süngüsü olan, süngü taxılmış. *Süngülü tüfəng.*

**SÜNİ** *sif.* [*ər.*] 1. Təbii deyil, insan əli ilə düzəldilmiş, əslində olduğu kimi düzəldilmiş. *Süni dişlər. Süni lif. Süni dəri. Süni işıq.*

2. Saxta, uydurma, qeyri-səmimi. *Süni gülüş*. – [Oqtay:] *Mən artıq süni bir həyata soxulmaram*. C.Cabbarlı. [Cəlil Məmmədquluzadə] *heç vaxt süni süjetlər, uydurma hekayələr yaratmır*. M.İbrahimov. *Səfir süni təbəssümlə ayağa qalxdı və ona tərəf getdi*. P.Makulu.

**SÜNİLƏŞDİRİLMƏ** "Süniləşdirilmək"dən *f.is.*

**SÜNİLƏŞDİRİLMƏK** *məch.* Süni hala gətirilmək, qeyri-təbii hala salınmaq, saxtalaşdırılmaq, bayağılaşdırılmaq.

**SÜNİLƏŞDİRMƏ** "Süniləşdirmək"dən *f.is.*

**SÜNİLƏŞDİRMƏK** *f.* Süni etmək, qeyri-təbii hala salmaq, saxtalaşdırmaq, bayağılaşdırmaq.

**SÜNİLİK** *is.* Saxtalıq, qeyri-təbiilik, qeyri-səmimilik. [Mirzə Cəmilin] *səsində, danışıq tərzində heç bir sünilik duyulmurdu.* Ə.Vəliyev. *Səməd əmisinin qaqqıltılı gülüşündəki qeyri-təbiiliyi duymasa da, öz gülüşünün süniliyini hiss etdi.* İ.Hüseynov.

**SÜNNƏT** *is.* [*ər.*] *din*. Müsəlmanlarda, yəhudilərdə: yetkinlik yaşına çatmamış oğlan uşaqlarının kişilik əzasının ucunu örtən dərinin kəsilməsindən ibarət əməliyyat. ☐ **Sünnət toyu** – köhnə məişətdə: uşağın sünnət edilməsi münasibətilə düzəldilən şənlik. [Mirzə Bağır Mirzə Həsənə:] *Qarğadələn Mələkin oğlunun sünnət toyunda Nazı Ağakişinin Zurnaburun Abbasqulunu öldürməyi yadındadırmı?* Çəmənzəminli. [Qaçay Veysələ:] *Əvvəlcə sənin toyunu mən eləyəcəyəm, sonra sünnət toyuna gedəcəksən.* Ə.Vəliyev.

**SÜNNİ** *is.* [*ər.*] İslam məzhəblərindən birinin adı. *Bu kəndin* [Mərğuzlunun] *əhli sünni, Mollu kəndinin əhli isə şiədir*. "Qaçaq Nəbi". *Şiəyəm, amma nə bu əşkaldən; Sünniyəm, amma nə bu əmsaldən; Sufiyəm, amma nə bu abdaldən; Həq sevən insanəm, a şirvanlılar!* M.Ə.Sabir.

**SÜNNİLİK** *is.* Sünni məzhəbinə mənsubluq. *Sünnilik ilə şiəliyi qaldıracaqlar; İslama yetib rəxnə, xələldar olacaqdır*. M.Ə.Sabir.

**SÜPRƏK** *is. bot.* Taxıllar fəsiləsindən birillik ot cinsi.

**SÜPRÜM** *is. bot.* Yetişdikdə kökündən ayrılaraq küləklə diyirlənib yox olan çöl və ya səhra bitkisi.

**SÜPÜRGƏ** *is.* Süpürmək üçün topa halında bağlanmış nazik çubuqlardan, ya budaqcıqlardan ibarət alət. *Narın süpürgə. Şax süpürgə. Çubuq süpürgə. – Səfər əlində süpürgə daxil olur*. C.Cabbarlı. *Dalandar əlindəki süpürgəni divara söykədi.* M.Hüseyn.

◊ **Süpürgə çəkmək** – yığıb-yığışdırmaq, aparmaq, hər nə var götürüb aparmaq. *Oğrular evə süpürgə çəkdilər*. – [Əminə Allah-

quluya:] *O gördüyün zirzəmiyə elə bil süpürgə çəkilib*. Ə.Əbülhəsən.

**SÜPÜRGƏÇİ** *is.* 1. Vəzifəsi binanı, həyəti, küçəni və s.-ni süpürmək olan adam. *Süpürgəçi qadın otaqları təmizləyirdi.* Mir Cəlal.

2. Süpürgə bağlayıb satan adam. *Süpürgəçidən bir süpürgə aldım*.

**SÜPÜRGƏÇİLİK** *is.* Süpürgəçinin işi. [Firəngiz:] *Yeddinci sinfi bitirənə qədər süpürgəçilik elədim*. B.Bayramov.

**SÜPÜRGƏÇÖPÜ** *is. bot.* Dağlıq yerlərdə bitən, süpürgə bağlanan bitki.

**SÜPÜRGƏLƏMƏ** "Süpürgələmək"dən *f.is.*

**SÜPÜRGƏLƏMƏK** *f.* Süpürgə ilə təmizləmək, süpürgə ilə süpürmək. *Otaqları süpürgələmək.*

**SÜPÜRGƏSAQQAL** 1. *is.* İrisaqqallı, qorxunc görkəmli, mövhumi vücud (uşaqları qorxutmaq üçün işlənir). *Əsəd, xortdan deyil, süpürgəsaqqaldır, – deyə biri söylədi*. B.Talıblı.

2. *sif.* Sıxsaqqallı, irisaqqallı.

**SÜPÜRLƏMƏ** "Süpürləmək"dən *f.is.*

**SÜPÜRLƏMƏK** *f.* 1. Birdən üstünə atılıb əlləri ilə bərk-bərk yapışmaq, tutub yıxmaq. [Cənnətəli ağa:] *Ay.. hanı o günlər ki, on beş nökər ilə kəndin üstünə bulud kimi çöküb, bunu burda süpürləyir idim, onu orda*. N.Vəzirov.

2. Hamısını qapıb götürmək, qarışdırmaq. *Şeyləri süpürləmək. – Palina güzgünün qabağındakı ətir şüşələrini süpürləyib səbətə doldurdu.* H.Seyidbəyli.

**SÜPÜRLƏŞMƏ** "Süpürləşmək"dən *f.is.* *Qurbanın evində görünməyən bir süpürləşmə əmələ gəldi*. S.Rəhimov.

**SÜPÜRLƏŞMƏK** *f.* Bir-biri ilə qarpışmaq, tutuşmaq, qapışmaq. *Pəhləvanlar süpürləşdilər. – Uşaqlar torpaqdan sümüyü götürəndə bir-birinə aman vermir, süpürləşib yerə yıxılırdılar*. Çəmənzəminli. *..Qapıçı Qədim dayını geri itələdi. Onlar süpürləşdilər*. S.Rəhimov.

**SÜPÜRMƏ** "Süpürmək"dən *f.is.*

**SÜPÜRMƏK** *f.is.* Bir yerin zibilini, töküntüsünü və s.-ni süpürgə, ya şotka ilə təmizləmək. *Evi süpürmək. Həyəti süpürmək.* – ..[Ağabala] *məktəbi hər gün süpürər, bazara gedib mollaya piti alardı.* Çəmənzəminli. [Səfər Səriyyəyə:] *Xanım, dur, o biri otağa keç, buranı süpürüm.* C.Cabbarlı.

◊ **Süpürüb yemək** – tərtəmiz yemək, boşqabda heç bir şey qoymayıb hamısını yemək. *Razaqla Burun Fərəc plovu süpürüb yedilər*. S.Rəhimov.

**SÜPÜRTMƏ** "Süpürtmək"dən *f.is.*

**SÜPÜRTMƏK** *icb.* Süpürgə ilə zir-zibili təmizlətmək. *Həyəti süpürtmək.* – [Pristav Zeynal bəyə:] *Barı dəftərxanaya gələn küçəni süpürt ki, qubernator görüb acığı tutmasın*. Çəmənzəminli.

**SÜPÜRÜLMƏ** "Süpürülmək"dən *f.is.*

**SÜPÜRÜLMƏK** *məch.* Süpürgə ilə təmizlənmək. *Həyət tərtəmiz süpürülüb. – Yardım olmaq üçün otağın süpürülüb təmizlənməsini* [Sarıköynəyə] *tapşırar, zəhmət haqqı verərdim*. S.Hüseyn.

**SÜPÜRÜNTÜ** *is.* Süpürülən yerdən çıxan zir-zibil, tör-töküntü. *Süpürüntünü aparıb atmaq*.

**SÜPÜRÜŞMƏ** "Süpürüşmək"dən *f.is.*

**SÜPÜRÜŞMƏK** b a x **süpürləşmək**. *Şehlidə bir neçə qız-gəlin .. yasavulun otaqçasında pörtüncəyə qədər bir-birilə süpürüşərdilər.* S.Rəhimov. *Cavanlar oynaşıb, süpürüşürdülər; Zarafat eyləyib, gülüşürdülər*. H.K.Sanılı.

**SÜRAHİ** *is.* [*ər.*] 1. Su və ya şərab tökmək üçün uzunboğaz şüşə qab. [İbrahim:] *Bilmək istəyirəm, bu sürahilərdə nə var?* N.Vəzirov. [Qaragün] *tez-tez yerində o tərəf-bu tərəfə çevrilir, ufuldayır, sürahidəki tünd-al şərabdan piyalə-piyalə içir, yenə rahat ola bilmirdi.* M.Rzaquluzadə. // *məc.* Şairanə təşbehlərdə gözəlin boyuna, gərdəninə işarə, yaxud incəlik, zəriflik, ağlıq mənasında. *Boyun sürahidir, bədənin büllur; Gərdənin çəkilmiş minadan, Pəri.* M.P.Vaqif. *Bilmədim qədrini günəş camalın; Sürahi gərdənin, çöhrəyi-alın.* Q.Zakir. *Həsənin kobud və nahamar əlləri Sitarənin sürahi əllərinə toxunanda sanki Mənsurun ürəyinə ildırım toxundu*. C.Cabbarlı.

2. Məhəccər. *Vaqif başını artırmanın sürahisindən aşağı sallayıb: – Ay camaat, xan bugünkü dustaqlarının təqsirini .. bağışlayır*. Çəmənzəminli. *Telli içəri keçir, Fəridə sürahiyə yaxınlaşır.* Ə.Məmmədxanlı.

**SÜRBƏ** *is.* Sürü, dəstə, qatar. *Qaz sürbəsi. – Şahin, şonqar sürbənizi dağıdar; Boyanarsız qızıl qana, durnalar!* M.V.Vidadi. *Uçurdu havada durna sürbəsi; Gəlirdi qulağa qurqur nəğməsi*. H.K.Sanılı.

**SÜRDÜRMƏ** "Sürdürmək"dən *f.is.*

**SÜRDÜRMƏK**[1] *icb.* Bir səmtə, bir tərəfə yönəltdirmək, istiqamət verdirmək. [Nuriyyə:] *Maşını Ələsgər dayıgilə sürdürdüm.* İ.Əfəndiyev. ..[Mirzə:] *Fayton çağırdım. Birbaş kəndə sürdürdüm*. Mir Cəlal. *Kamil ən uca qayaya çıxmaq üçün qayığı o səmtə sürdürdü*. M.Süleymanov.

**SÜRDÜRMƏK**[2] *icb.* Şumlatmaq. *Rüstəm kişinin fikri bu idi ki, maşın-traktor stansiyası ilə danışsın, cücərməyən sahələri pambıq şumunun içinə qatsın, traktorla sürdürüb əkdirsin*. M.İbrahimov.

**SÜRƏK**[1] *is.* Bir şeyin sürdüyü, davam etdiyi müddət; davam.

**SÜRƏK**[2] *is.* 1. Heyvan sürüsü, böyük sürü. *Öküz alırsan sürəkdən al, qoyun alırsan maldardan*. (Ata. sözü).

2. Bir və ya bir neçə heyvanın ovçular tərəfindən dövrəyə alınması, yaxud yuvasından çıxarılması işi. *Sürəkdən qurtarmış körpə maraltək; Saçları dağınıq, əlində ətək; Yellənə-yellənə gəlir, qaçaraq*. H.K.Sanılı.

**SÜRƏKÇİ** *is. ovç.* Kollektiv heyvan ovunda ovu ovçulara tərəf qovan adam.

**SÜRƏKLİ** Çox sürən, davamlı, uzun. *Sürəkli xəstəlik. – Sürəkli alqışlarla Sona xala kürsüdən endi*. S.S.Axundov. [Yağış] *bir saat sürəkli yağarsa, aləmi tufana verir*. A.Şaiq. *Dəstənin sürəkli atəşi hamıya ürək verdi*. M.Hüseyn.

**SÜRƏKLİLİK** *is.* Sürəkli olma, uzun sürmə, davamlılıq.

**SÜRƏKSİZ** *sif.* Çox sürməyən, çox davam etməyən, çox çəkməyən, davamsız, çox qısa.

**SÜRƏKSİZLİK** *is.* Sürəksiz olma, çox sürməmə, çox davam etməmə, qısalıq.

**SÜRƏT** *is*. [*ər.*] 1. Hər hansı bir hərəkətin itilik, tezlik dərəcəsi; çapıqlıq. *Qaçışın sürəti. Səsin sürəti. Uçuşun sürəti. – Ay saf göydə öz gediş sürətini artırmamış, ağ pambıq kimi seyrək buludlar onu gəlin aparan kimi əhatə etmişdilər.* H.Nəzərli. *Maşın get-gedə sürətini artıraraq yağ kimi sürüşürdü*. S.Rəhman.

☐ **Sürət qatarı** – böyük sürətlə işləyən, çox iti gedən qatar. // Hər hansı prosesin, işin gedişindəki tezlik dərəcəsi. *Əqrəbin sürəti. Hesablamanın sürəti. Atışın sürəti.*

2. *fiz*. Cismin keçdiyi yolun müvafiq saata olan nisbəti. *Sürət vahidi. Sürətin hesablanması*.

**SÜRƏTÇİ** *is.* 1. Çox sürətli iş üsulları mütəxəssisi, çox sürətli üsullarla işləyən fəhlə. *Sürətçilər briqadası*.

2. Sürətli qaçış ustası olan idmançı.

**SÜRƏTLƏ** *zərf* Tez, cəld, iti. *Sürətlə uzaqlaşmaq. Sürətlə addımlamaq. – Xudat stansiyasından Qusara gələn avtobus sürətlə boşaldı.* Çəmənzəminli. *Çayın dilə gəlmiş suyu sürətlə ətrafa yayılır, o taydakı çəltik və pambıq əkinlərini yalayıb udurdu.* Ə.Vəliyev.

**SÜRƏTLƏNDİRİCİ** *is. tex.* Bir prosesi sürətləndirən cihaz, qurğu, maddə və s. // Sif. mənasında. *Sürətləndirici cihaz.*

**SÜRƏTLƏNDİRMƏ** "Sürətləndirmək"dən *f.is.*

**SÜRƏTLƏNDİRMƏK** *f.* 1. Sürətini artırmaq, tezləşdirmək. *Addımlarını sürətləndirmək. İşi sürətləndirmək. – Bəbirbala maşını sürətləndirdi*. S.Rəhimov.

2. Tezləşdirmək, zamanca yaxınlaşdırmaq. *Səfəri sürətləndirmək. Müalicəni sürətləndirmək.*

**SÜRƏTLƏNMƏ** "Sürətlənmək"dən *f.is.*

**SÜRƏTLƏNMƏK** *f.* 1. Daha da sürətli olmaq, sürəti artırmaq, tezləşmək. *Hərəkət sürətləndi. Sel get-gedə sürətləndi.*

2. Tezləşmək, qabağa düşmək, tez əmələ gəlmək, tez baş vermək. *Hadisələr sürətləndi.*

**SÜRƏTLİ** *sif.* Çox iti, çox yeyin, çox çapıq (hərəkət haqqında). *Sürətli cərəyan. Sürətli qaçış. – Sürətli dalğalarla siz bizə yaxlaşınca; İçimizə həyatın cilvələri saçılır*. M.Müşfiq. *Tahirzadə sürətli addımlarla qabağa keçəndə hamı susdu.* Mir Cəlal.

**SÜRƏTÖLÇƏN** *is.* Avtomobilin, motosiklin hərəkətinin sürətini, habelə onların keçdiyi məsafəni göstərən cihaz; spidometr. *İndi sürətölçənin əqrəbi axıra dirənsə də, Çiçək Ümidi danlayırdı*. B.Bayramov.

**SÜRƏYYA** *is.* [*ər.*] Yeddiqardaş ulduzlar, ülkər, pərvin.

**SÜRFƏ** *is.* [*ər.*] *zool.* Canlı orqanizmin (həşəratın, cücülərin və s.-nin) ilk inkişaf mərhələlərindən biri, pupun ilk inkişaf dövrü.

**SÜRGƏC** *is.* Kirşələrin ağac (ya metal) parçasından ibarət olan, qar üzərində sürüşən alt hissələrindən hər biri.

**SÜRGÜ** *is.* Qapını, pəncərəni daldan bağlamaq üçün ağac və ya dəmir parçası; kilid, qol. *Qapının sürgüsünü vurmaq*. // Cəftə, rəzə.

**SÜRGÜQOLU** *is.* 1. *tex.* Maşında, mexanizmdə pistonu (porşeni) mühərrikin valı ilə birləşdirən və işləyəndə hərəkəti ötürən detal, hissə. *Pistonun aşağıya hərəkəti sürgüqolu vasitəsilə dirsəkli vala keçərək onu fırlanmağa məcbur edir.* "Traktorçuya kömək".

2. *xüs.* Bəzi odlu silahlarda atəş açmaq üçün müxtəlif şəkildə qurulmuş mexanizm. ..[Kəyan] *pulemyotun dalına atılıb, sürgüqolunu iki dəfə dala verdi*. Ə.Əbülhəsən.

**SÜRGÜN** *is.* 1. Məhkəmənin hökmü ilə cəza olaraq bir şəxsi məcburi surətdə başqa (adətən uzaq) bir yerə köçürmə, cəza çəkmək üçün yaşadığı yerdən başqa bir yerə göndərmə. *Sürgün cəzası. Ömürlük sürgün. Sürgünə göndərmək. – Axırda* [Seyranı] *da, fəhlə yoldaşlarının bir neçəsini də Sibirə sürgün elədilər*. M.Hüseyn. *..Kütləvi həbslər zamanı Kərimxan Azadini də tutmuş və iki ay zindanda saxladıqdan sonra cənuba sürgün eləmişdilər*. M.İbrahimov. // Sürgündə olan adam.

2. Sürgün yeri. *Sürgündə qalmaq. – Dolmuş ağzınadək bütün qalalar; Zəncirlər səslənir uzaq sürgündə*. S.Vurğun. *..Azadlıq üçün minlər və on minlərlə inqilabçılar sürgünlərdə, həbsxanalarda canlarını çürüdüblər*. Ə.Sadıq.

**SÜRMƏ**[1] *is.* 1. Qadınların qaşlarına, gözlərinə çəkdikləri qara boya, toz. *Sürmə çox olanda gözə də çəkərlər, qaşa da*. (Məsəl). *Sürmə çəksin gözlərinə, qaşına; Gündə yüz yol mən dolanım başına*. Q.Zakir. [Hafizə xanım Sayada:] *O nə sürmədir gözünə çəkibsən? İtil burdan*. Ə.Haqverdiyev.

2. Kimyəvi element, gümüşü kövrək metal. *Ayrı-ayrı kimyəvi elementlərdən isə alüminium, vanadium, sürmə, volfram, nikel, kobalt, qurğuşun və radioaktiv metalların yeni yataqlarının axtarışı xüsusi əhəmiyyət kəsb edir*. M.Qaşqay.

3. Sünbüldə dənlərin qaralıb toz halına gəlməsindən ibarət taxıl xəstəliyi.

**SÜRMƏ**[2] *is.* bax **siyirmə**[2]. *Stolun sürməsini açmaq.*

**SÜRMƏ**[3] bax **siyirmə**[3]. [Gilə] *içəri girib qapını örtdü və sürməsini vurdu*. Ə.Vəliyev. [Hacıgili] *..qapını əl ilə bağlayıb, açılmasın deyə uzun ağac sürməni də keçirmişdilər dalına*. İ.Əfəndiyev.

**SÜRMƏK**[1] *f.* 1. Qabağına qatıb irəli hərəkət etdirmək, aparmaq, istiqamətləndirmək. *Qoyunları sürmək. Naxırı çölə sürmək. – Divar dibində, kölgədə xoruz, toyuqlar uyqular; Naxırçılar qaramalı sürüb sərin suya salar*. A.Səhhət. // Arabaya və s.-yə qoşulmuş heyvanı yeriməyə təhrik etmək, məcbur etmək, haylamaq. *Əsəd* "*he-he*" *deyə-deyə öküzləri sürməkdə idi*. C.Məmmədquluzadə. *Novruz istəyirdi atları sürsün*. N.Nərimanov. *Qatırı sürən* (f.sif.) *kişi dəstəni saxladı*. S.Vəliyev.

2. Hərəkət edən şeyi (avtomaşını, təyyarəni, gəmini və s.-ni) idarə etmək. *Kombayn sürmək. Velosiped sürmək. Tramvay sürmək. – Şofer maşını geriyə döndərdi və hamar yolla sürərək vağzala istiqamət aldı*. M.Hüseyn. [Xala Yunisə:] *Deyirlər, Yaqut əyriplan sürür, göydə uçur*. Ə.Məmmədxanlı.

3. Qovmaq, sürgün etmək, cəza olaraq uzaqlara göndərmək. [Paşa bəy xana:] *A kişi, indi danışanda bizi sürməyəcəklər ki, sözdür...* Çəmənzəminli.

4. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ömür sürmək, həyat sürmək, dövran sürmək, cəfa sürmək və s.

**SÜRMƏK**[2] *f.* 1. Davam etmək, çəkmək. *Külək üç gün sürdü. İclas iki saat sürdü. Xəstəliyi uzun sürdü.*

2. Vaxt keçmək, zaman keçmək. *Heç bir saat sürmədi ki, özü gəldi.*

**SÜRMƏK**[3] *f.* Şumlamaq. *Tarlanı sürmək.*

**SÜRMƏLƏNMƏ** "Sürmələnmək"dən *f.is.*

**SÜRMƏLƏNMƏK** *qayıd.* Qaşlarına, gözlərinə, kirpiklərinə sürmə çəkmək. *Bir qıya çəkəndə aldı canımı; Gözləri qüdrətdən sürmələnibdir.* Aşıq Ələsgər. *Şəhla xanım sürmələnmiş* (f.sif.) *qaşlarını dartdı*. S.Rəhimov.

**SÜRMƏLİ** *sif.* Sürmə çəkilmiş. *Qaş-gözü sürməli qadın.* – [Gəlin] *sürməli gözlərini yerə dikib, utandığından kimsəyə baxa bilmirdi.* Çəmənzəminli. [Nabat] *ucaboylu, tənumənd, gözləri yaranışından sürməli bir qadın idi.* İ.Əfəndiyev.

**SÜRMƏYİ** *is.* Qara ilə göy arasında tünd rəng. // *sif.* Bu rəngdə olan. *Sürməyi parça. Sürməyi rəng. Sürməyi paltar.* – [Nərimanın] *ayaqlarında uzunboğaz çəkmə, əynində sürməyi yun parçadan köynək-şalvar var idi.* İ.Əfəndiyev. [Mehribanın] *sürməyiyə çalan qara gözlərində həmişə kədər oxunurdu.* H.Seyidbəyli.

**SÜRPRİZ** *is.* [*fr.*] Gözlənilməyən hədiyyə, yaxşılıq, xoş xəbər.

**SÜR-SÜMÜK** *top.* İri və xırda sümüklər. *Adama elə gəlirdi ki,* [Karlın] *tərpənən kimi bütün sür-sümüyü bəndlərindən aralanıb töküləcəkdir.* Ə.Əbülhəsən. // Ümumiyyətlə, sümüklər, sümük qırıntıları. *Bu ət deyil, sür-sümükdür.* – *Bu işıldayanlar yaz balıq ovu zamanından burada tökülüb qalmış fosforlaşmış balıq çürüntüsü və sür-sümükləri idi.* M.Rzaquluzadə.

**SÜRTGƏC** *is.* 1. Tərəvəzi və s.-ni xırdalamaq, meyvənin suyunu çıxarmaq üçün iti dişcikləri və deşikləri olan metal və s.-dən alət, lövhəcik. *Kələmi sürtgəcdən keçirmək. Çuğunduru sürtgəcdən keçirmək.*

2. Suvağın üzünü düzəltmək və hamarlamaq üçün dəstəkli kürəkcik – malakeş aləti. *Divarı sürtgəclə hamarlamaq.*

**SÜRTKÜ** *is.* Sürtməyə məxsus maddə. □ **Sürtkü yağları** – bir şeyi yağlamaq, sürtmək üçün neftdən emal edilən yağların ümumi adı. *Yanacaq və sürtkü yağları ehtiyatı.* – [Mazutdan] *vazelin, parafin və sürtkü yağları alırlar.* "Üzvi kimya".

**SÜRTMƏ** "Sürtmək"dən *f.is.*

**SÜRTMƏK** *f.* 1. Əlini bədənin müəyyən yerinə basa-basa o tərəf-bu tərəfə gəzdirmək, ovxalamaq. *Qolunu sürtmək. Üzünü sürtmək. Kürəyini sürtmək.* – [Fatma:] *Hərdən əlini başına sürtüb, al qana bulaşmış bir halda ay işığına tutur, şikayətlənirdi...* Çəmənzəminli. [Yusif:] *Qara kəlin boynuna keçi piyi sürtməklə onun yerişini, gücünü artırmaq olmaz, onun ayağı ilə maşına çatmaq olmaz.* B.Bayramov.

2. Sürtərək xırdalamaq, doğramaq, şirəsini çıxartmaq. *Çuğunduru sürtgəcə sürtmək.*

3. Hərəkət zamanı ağrı vermək, dərini incitmək, əziyyət vermək, zədələmək. *Çəkmə ayağımı sürtür.*

4. Çəkmək, toxunduraraq gəzdirmək, dəydirmək. [At] *Kərbəlayı Qasımın dalınca gedə-gedə hərdən alnını sürtürdü Kərbəlayı Qasımın kürəyinə.* C.Məmmədquluzadə. *Sürtdü kamançaya ayı əllərin; Az qaldı ki, lap qopara tellərin.* A.Səhhət.

5. Qum, pasta və s. ilə sürtüb təmizləmək. *Qabları sürtmək. Vannanı sürtmək.* – *Qız əlində samovarın qara qapağını sürtə-sürtə saçı, başı nizamsız özünü bayıra atır.* H.Sarabski.

6. *məc. məh.* Süründürmək. *Mədət başını bulayaraq oturmuş, Sübhanverdizadəyə olan borcunu necə olur olsun bu ayın içində vermək qərarına gəlmişdi. Əfruz bacı isə bu pulu sürtməyi qət etmişdi.* S.Rəhimov.

**SÜRTÜK**[1] *sif.* 1. Sürtülmüş halda olan, çox sürtülməkdən yazısı, naxışı silinib getmiş, pozulmuş. *Sürtük sikkə.*

2. *məc.* Sırtıq, üzlü, həyasız, utanmaz. *Sürtük adam.*

**SÜRTÜK**[2] [*fr.* surtout – enli üst paltarı] Beli dar, uzunətəkli, ikibortlu kişi üst geyimi. *Həsənqulu bəy sürtükünü geyir.* Ü.Hacıbəyov. [Xortdan:] *Bir nəfər arıq, əynində bozarmış sürtük .. bir hampa kəndli ilə mübahisə eləyirdi.* Ə.Haqverdiyev.

**SÜRTÜKLÜK** *is.* 1. Sürtülmüş şeyin halı.

2. *məc.* Sırtıqlıq, üzlülük, həyasızlıq, utanmazlıq.

**SÜRTÜLMƏ** "Sürtülmək"dən *f.is.*

**SÜRTÜLMƏK** 1. "Sürtmək"dən *məch.* *Aynabəndin döşəməsi ayaqlar altında o qədər sürtülmüşdü ki, taxtaların talaşası çıxmışdı.* Mir Cəlal. *Musa kişi daha tərəddüd etmədən əlini cibinə salıb, üzü sürtülmüş* (f.sif.), *dördqat dəftərçəsini çıxartdı.* B.Bayramov.

2. Çəkilmək, yaxılmaq. *Dezinfeksiya üçün yaraya yod sürtülür.* – *Get-gedə Müqüm bəy Cavanşirin zabitəsi birə yüz artır, o, sürtülüb yağlanan bir qılınc kimi bərq verirdi.* S.Rəhimov.

**SÜRTÜNMƏ** "Sürtünmək"dən *f.is.*

**SÜRTÜNMƏK** *qayıd.* Özünü bir şeyə sürtmək, toxundurmaq. *Divara sürtünmək. Ağaca sürtünmək.* – *Naxırdan ayrılaraq həyətə dön-*

*müş sarı inək ağır-ağır yeriyib Səkinənin yanına gəldi, yorğun-yorğun ona sürtündü.* M.İbrahimov. *Mal-qara sürtünüb bəzi ağacların tənəyini salmışdı*. B Bayramov.

**SÜRTÜŞKƏN** *sif.* Sürtüşməyi (adama sataşmağı) sevən, adama sataşmağı adət etmiş, adama sataşan.

**SÜRTÜŞKƏNLİK** *is.* Adama sürtüşmək, sataşmaq xasiyyəti.

**SÜRTÜŞMƏ** "Sürtüşmək"dən *f.is.*

**SÜRTÜŞMƏK** *f.* 1. *qarş*. Bir-birinə sürtünmək, toxunmaq. // Toxunmaq, dəymək, sürtünmək. [Münəvvər xanım:] *Vallah, mərəzin şiddətindən libaslarım bədənimə sürtüşəndə bədənim bütün sızıldayır*. M.S.Ordubadi. [Dadaş Balaxanıma dedi:] *Keçinin əcəli gələndə çobanın çomağına sürtüşər*. S.Rəhimov.

2. *məc.* Sataşmaq, toxunmaq. [Telli:] *Min yol sənə demişəm, mənə sürtüşmə, xeyir aparmazsan*. N.Vəzirov.

**SÜRÜ** *is.* Bir yerdə otlayan, adətən bir cür heyvan dəstəsi. *Qoyun sürüsü. İnək sürüsü. Quzu sürüsü. – Sürülər, itlər, çobanlar ormana, sərin kölgəliklər altına çəkilmişdi..* A.Şaiq. *Ferma işçiləri sürünü qarşıladı*. M.İbrahimov. // Bir yerdə saxlanan bir cür quş, balıq və digər heyvan qrupu. *Bir neçə həftə az qala ayaq altında üzən ördək sürüsü, indi Qara daşlardan otuz-otuz beş addım uzaqda idi*. M.Hüseyn. // *məc*. Qarmaqarışıq, nizamsız böyük insan dəstəsi.

◊ **Bir sürü** – çoxluq bildirir. [Mirzə:] *Bizim bir balaca hesabımız var, ondan ötrü gəlmişəm, vəssalam, nə lazım qardaş, kasıb adamam, bir sürü külfət sahibiyəm, zarafat deyil.* N.Vəzirov. [Ağa:] *Kəndin bir sürü itləri tökülüb üstümə, başladılar məni dartışdırmağa.* Ə.Haqverdiyev.

**sürü-sürü** *sif.* Sürülərlə, böyük-böyük dəstələrlə; çoxlu, saysız-hesabsız. *Sürü-sürü qoyun-quzu. – O qarlı dağları duman bürüdü; Çar tərəfdə qoşun sürü-sürüdü.* "Qaçaq Nəbi". *Sürü-sürü qoyunları çoban yamacda otladır; Alar ələ papağını, oxur şikəstə, fit çalır.* A.Səhhət.

**SÜRÜCÜ** *is.* Maşını, traktoru və s.-ni idarə edən, sürən adam (şofer, traktorçu və s.). *Üç yolun ayrıcında dayanmış traktorun; Sürücüsü yol verir gedən-gələn maşına.* Ə.Cəmil.

**SÜRÜCÜLÜK** *is.* Sürücü işi, nəqliyyat vasitəsini və s.-ni sürmə işi. *Sürücülük vəsiqəsi almaq. Sürücülük təlimi keçmək. Sürücülük öyrənmək.*

**SÜRÜKLƏMƏ** "Sürükləmək"dən *f.is.*

**SÜRÜKLƏMƏK** *f.* 1. Bir şeyi yerdən qaldırmadan sürüyə-sürüyə aparmaq, çəkə-çəkə (darta-darta) aparmaq; sürümək. [Kimon] *İncini dar ağacına sarı sürükləyir*. A.Şaiq. [Səməd:] *Qolçomaqlar bizim kolxozu görmək istəməyirlərdi... Axırda onların hamısını sürükləyib kənddən çıxartdıq.* T.Ş.Simurq. *Ayaqlarındakı nəleyinləri sürükləyən bu qadınlar qaz kimi yayxana-yayxana elə ağır-ağır yeriyirdilər ki, canım sıxılırdı.* Ə.Məmmədxanlı.

2. *məc.* Çəkib aparmaq, sövq etmək, cəzb etmək, cəlb etmək; aparıb çıxarmaq. *..Digər tərəfdən cazibəli bir qüvvə* [Fatmanı] *qapıya doğru sürükləyirdi*. Çəmənzəminli. *İnsanı pisliklərə sürükləyən bəlaların birisi və ən qorxulusu da şübhədir.* S.Vurğun. *..Həyatın təbii axını* [Səriyyəni] *bir kor kimi istədiyi səmtə sürükləyirdi.* M.İbrahimov.

**SÜRÜKLƏNMƏ** "Sürüklənmək"dən *f.is.*

**SÜRÜKLƏNMƏK** bax **sürünmək** 1-ci mənada.

**SÜRÜLMƏ¹** "Sürülmək¹"dən *f.is.*

**SÜRÜLMƏ²** "Sürülmək²"dən *f.is.*

**SÜRÜLMƏK¹** *məch.* 1. Qovulmaq, aparılmaq. *Naxır fermaya sürüldü.*

2. Sürgün edilmək. [Hacı Nuru şair Səfər bəyə:] *Axırda nadinc adam qələminə getdin. Üç il divana düşdün, üç il sürgünə sürüldün, gözəl ömrün keçdi.* M.F.Axundzadə. [Kətxuda:] *Bir-iki adam gərək bu kənddən sürülə, özü də sizin məhəllədən.* N.Nərimanov.

**SÜRÜLMƏK²** *f.* 1. Şumlanmaq. *Sürüləcək yerin hələ ondan biri şumlanmamışdı*. M.İbrahimov. *Hatəm dayı .. sürülmüş* (f.sif.) *zəmilərə .. baxırdı.* Mir Cəlal.

2. *məc.* Sövq edilmək, cəlb edilmək. *Lakin bunu bilməlisiniz ki, sizə güllə atan soldatlar da sizinlə müharibəyə məcburiyyətlə sürülür.* M.S.Ordubadi.

**SÜRÜMƏ** "Sürümək"dən *f.is.*

**SÜRÜMƏK** *f.* Zorla çəkib aparmaq və ya gətirmək; dartmaq, çəkmək, darta-darta, çəkə-çəkə, sürüyə-sürüyə aparmaq (gətirmək). *Uşağı əlindən tutub sürümək.* – [Usta:] *Qor-*

*xumdan səsimi çəkdim içəri. İpi bağladılar, söyə-söyə sürüyüb apardılar.* Çəmənzəminli. *Tövlənin qapısı açıldı və cahıllar kəhildəyə-kəhildəyə atları tövləyə çəkib, kişmiş taylarını sürüyüb saldılar tövlənin bucağına.* C.Məmmədquluzadə. [Durna:] *..Çay başından gəlirkən saçlarımı əllərinə doladı. Kəndin içindən sürüdü..* C.Cabbarlı.

**SÜRÜNDÜRMƏ** 1. "Süründürmək"dən *f.is.*
2. Süründürməçilik.

**SÜRÜNDÜRMƏÇİ** *is.* Bir işi, ya bir adamı qəsdən süründürən, get-gələ salan, özünə tapşırılan bir işi qəsdən uzadan, ləngidən adam. [Yusif:] *Yoldaş Əlizadə, nə qədər elə süründürməçilər tapılsa, yeri düşdükcə, başımız ağrıyacaqdır.* B.Bayramov.

**SÜRÜNDÜRMƏÇİLİK** *is.* Bir işi, məsələni qəsddən uzatma, həllini gecikdirmə, ləngitmə, get-gələ salma; lüzumsuz rəsmiyyətçilik. *Süründürməçiliklə mübarizə.*

**SÜRÜNDÜRMƏK** *f.* Bir işi qəsdən ləngitmək, uzatmaq, yubatmaq, gecikdirmək; başda dolandırmaq, get-gələ salmaq. *İşi süründürmək.* – [Nazlı Nataşaya:] *Eh, siz şəhər qızları çox ərköyünsünüz. Əzilirsiniz, süründürürsünüz, adamın canın üzürsünüz.* Ə.Məmmədxanlı. [Yusif müavinə:] *Yekə kişisən, ver planı, sənə deyirəm. Bu qədər süründürdün bəsdir.* B.Bayramov.

**SÜRÜNƏNLƏR** *cəm zool.* İlan, kərtənkələ, tısbağa, timsah və s. heyvanların daxil olduğu onurğalı heyvanlar sinfinin ümumi adı.

**SÜRÜNGƏL** *is.* Dağlarda sürüşkən, dar yerlər.

**SÜRÜNMƏ** "Sürünmək"dən *f.is.*

**SÜRÜNMƏK** *f.* 1. Üzüstə bütün bədənilə bir səth üzərində hərəkət etmək (sürünən heyvanlar haqqında). *Yolun kənarında ilan sürünür. – ..Bir əllərimi al-qırmızı boyayan qana, bir də otlar üstündə inildəyə-inildəyə sürünən* (f.sif.) *o kiçik heyvana baxdım.* A.Şaiq. // Qalxmadan, əlin, ayağın köməyilə qabağa doğru hərəkət etmək. *Bunu deyib, qadın gözlərindən yaş tökərək oğlanın ayağına sürünmək istədi.* Ə.Haqverdiyev. *Əşrəf yavaşcadan sürünüb kola yaxınlaşdı.* S.Rəhman.

2. *məc.* Zəhmət və məşəqqət içində yaşamaq, səfalət içində yaşamaq, acınacaqlı həyat keçirmək. [Mirzə Rza:] *Yazıq balalarım, ..Çil yavruları kimi hərə bir yana düşmüş, səfilanə sürünürlər.* C.Cabbarlı.

3. *məc.* Yavaş-yavaş hərəkət etmək. *Dərələrdən ağır duman sürünür; Göy yamaclar ağ örpəyə bürünür.* R.Rza. *Qıvrılıb ətəkdə bulud sürünür.* B.Vahabzadə.

**SÜRÜŞDÜRMƏ** "Sürüşdürmək"dən *f.is.*

**SÜRÜŞDÜRMƏK** *f.* Hamar bir səth üzrə hərəkət etdirmək, qaldırmadan irəli itələmək. *Lakin vəzifəlilər qədəhləri qabaqlarından ortaya sürüşdürdülər.* B.Bayramov.

**SÜRÜŞƏK, SÜRÜŞKƏN** *sif.* Tamamilə hamar, üstündə hərəkətə mane olacaq heç bir ilişik olmayan, üzərində heç bir şeyi saxlamayan. *Sürüşkən yol. Sürüşkən buz. Sürüşkən qaya. – Uşaq nə qədər çapaladısa, sürüşkən xəndəkdən çıxa bilmədi.* M.İbrahimov. *Ancaq sürüşkən otların üstü və sıx qamışların arası ilə yeyin getmək o qədər də asan bir iş deyildi.* M.Rzaquluzadə. *Sürüşkən daşın arasında bəzən balığın ancaq quyruğunun ucu ələ dəyərdi.* İ.Hüseynov.

**SÜRÜŞKƏNLİK** *is.* Sürüşkən şeyin halı. *..Təhlükəli cığırların yağışdan sonra daha təhlükəli olmuş sürüşkənliyi, atların daha ehtiyatlı addımları və yenidən başlayan çiskinin üz-gözümü sancan soyuq iynələri məni bu xəyal dünyasından ayırdı.* R.Rza.

**SÜRÜŞMƏ** "Sürüşmək"dən *f.is.*

**SÜRÜŞMƏK** *f.* 1. Hamar, sürüşkən səth üzərində hərəkət etmək. *Kirşə buzun üstündən sürüşüb keçdi.*

2. Asanlıqla hamar səth üstü ilə hərəkət etmək, irəliləmək. [Qasım:] *Dənizin üzü dələmə kimi idi. Gəmi suyu yara-yara sürüşürdü.* T.Ş.Simurq.

3. Sürüşüb düşmək, yerindən qaçmaq. *Papaq başından sürüşüb düşdü.* – [Sona anım:] *Xalçanı götürüb gəlirdim, başmağımın tayı ayağımdan sürüşüb çıxdı.* M.F.Axundzadə. *Ayaq altında dayanmayan narın isti qum sürüşüb aşağı getdikcə uşaqlar baxmır, tövşüyə-tövşüyə, ağır-ağır diklənirdilər.* Mir Cəlal. *Qızın qara çadrası başından sürüşüb boynuna düşdü...* Ə.Məmmədxanlı.

4. Sürüşə-sürüşə düşmək.

5. Çəkilmək. *İzzət Əhmədin yanına sürüşüb əlini qoydu oğlunun çiyninə və başını əydi onun başının üstə.* C.Məmmədquluzadə. *Pası*

*bir qədər kənara sürüşərək əllərini dizinə vurub: – Bir qulaq kağıza yüz manat, – dedi.* S.Rəhimov. [Surxay:] *Mehralı dayı, bir az o yana sürüş, qonağımız əyləşsin.* S.Rəhman.

6. *məc.* Gözə görünmədən, heç kəsə hiss etdirmədən getmək, yox olmaq, çəkilmək; əkilmək. [Molla] *başmağını astanada qoyub, ətəyini ovcuna yığdı, oğru pişik kimi sürüşdü.* Mir Cəlal. *Leytenant tezcə sürüşüb çıxdı.* S.Vəliyev.

**SÜRVƏ** *is. bot.* Dodaqçiçəklilər fəsiləsindən çoxillik və birillik ot və kolcuqlar.

**SÜS** *is.* Bəzək, zinət, bərbəzək. [Qızların] *boyunlarında, başlarında və barmaqlarında qızıl zinət və süs olmazdı.* H.Sarabski. *Belə gürşad yağmurlar üçün babalar deyiblər ki, "yağış yağar, varlının süsünü aparar, yoxsulun hisini – ağ ilə qara aşkar olar".* M.Rzaquluzadə. *Biri deyir: həyatın hüsnü, süsüdür sənət; Biri deyir: ürəyin döyüntüsüdür sənət.* B.Vahabzadə. ☐ **Süs vermək** – bəzək vermək, süsləmək. *Pəncərənin xırda, rəngbərəng şüşələrindən içəri düşən şüalar yerə döşənmiş xalıların boyalarına ayrıca bir süs vermişdi.* Çəmənzəminli.

**SÜSƏN** *is. bot.* İri bənövşəyi, göy və ya sarımtıl gülləri olan bitki və bu bitkinin gülü. *Süsəndən, sünbüldən, lalə, nərgizdən; Siyah tellərinə düz, qadan alım!* Aşıq Ələsgər. *Gəl qələm götürüb, qoşa saz tutaq; Süsənlər, sünbüllər, güllər bizdədir.* S.Vurğun.

**SÜSLƏMƏ** "Süsləmək"dən *f.is.*

**SÜSLƏMƏK** *f.* Bəzəmək, zinətləndirmək, bəzək, yaraşıq vermək. *Şairləri qanadında bəsləyən; İnsanların həyatını süsləyən; İncə ruhlu mələklərə and olsun.* M.Müşfiq.

**SÜSLÜ** *sif.* Bəzəkli, zinətli. *Xacə Nizamın işarəti və Hacibin toxunması ilə ortadakı pərdə qalxar, son dərəcə parlaq və süslü bir aləm görünər.* H.Cavid. [Sönməz:] *Solmaz atəşgahın süslü bir gəlinidir.* C.Cabbarlı.

**SÜST** *sif.* [*fars.*] 1. Hərəkət etməyə iqtidarı olmayan, halsız, taqətsiz. *Süst düşüb* (z.) *qalmaq.* – [Aslan bəy doktora:] *Bədənim elə süstdür ki, bu əl, bu ayaq, bu baş, bu gövdə sanki mənim deyildir.* A.Şaiq. [Rizvan] *vaqonun pilləkənindən süst halda üzü aşağı düşdü.* S.Rəhimov. *Hamısı süst və şüursuz düşüb ağırlaşmışdı.* Mir Cəlal.

2. *məc.* Hissiz, duyğusuz, key. *Bu sözlərin hamısını rədd edən Cəfərə Nelli süst bir sima ilə baxdı.* Çəmənzəminli. [Dərviş:] *Ruqiyyənin belə süst halı binəva qarını qorxudurdu.* A.Divanbəyoğlu. ☐ **Süst olmaq** – keyləşmək, kütləşmək. *..Əşyasına baxanda ləzzət alan gəlin indi çox laqeyd və süst olmuşdu.* M.Hüseyn.

3. *məc.* Cansıxıcı, maraqsız. *Yığıncaq çox süst keçdi.* – [Koxa:] *Qoy gəlsin, bizi əyləndirsin, yoxsa məclis çox süst keçir.* S.Rəhimov.

**süst-süst** *zərf* Süst halda, key-key. *Süst-süst dolaşmaq.*

**SÜSTLƏŞDİRMƏ** "Süstləşdirmək"dən *f.is.*

**SÜSTLƏŞDİRMƏK** *f.* Süstləşməsinə səbəb olmaq, keyləşdirmək. *Bədbin hisslər* [Nemətin] *bədənini süstləşdirməkdə idi.* Çəmənzəminli. *Görünməmiş vəhşiliklər Azərbaycan oğullarının əqidəsini süstləşdirmir, tutduqları yolun haqq və ədalət yolu olduğuna bir tikə şübhə oyandıra bilmir.* M.İbrahimov.

**SÜSTLƏŞMƏ** "Süstləşmək"dən *f.is.*

**SÜSTLƏŞMƏK** *f.* 1. Hissini, duyğusunu itirmək, sustalmaq, keyimək. *Güldəstə birdən-birə süstləşdi.* H.Seyidbəyli.

2. Donub qalmaq, quruyub qalmaq, kütləşmək. *Heyrətə düşmüş bağban, saçları çiyinlərindən üzü aşağı tökülən Həcəri gördü və heyrətlə süstləşib dayandı.* S.Rəhimov. *Cəlil danışdıqca Nəriman fikrə gedib süstləşirdi.* M.İbrahimov.

**SÜSTLÜK** *is.* Hissizlik, kütlük, keylik. *Özündə süstlük hiss etmək.* – *Qar lopa-lopa yağırdı. Gecəki kefdən sonra hər kəsdə bir süstlük vardı.* Çəmənzəminli. *İndi* [Veysəlin] *ürəyindəki nisgil azalmış, vücudundakı süstlük yoxa çıxmışdı.* Ə.Vəliyev. *Əsəbi gərginlikdən sonra, Səməd hər şeyə qarşı bir etinasızlıq, bədənində süstlük və yorğunluq hiss edirdi.* İ.Hüseynov.

**SÜTLÜKƏN** *is. bot.* Zəhərli ağ südəoxşar şirəsindən təbabətdə və s.-də istifadə edilən ot bitkisi.

**SÜTUN** *is.* 1. *arxit.* Binalarda və s. tikililərdə mərmərdən, daşdan və s.-dən düzəldilən hündür dirək. *Sarayın bəzəkli sütunları.* – *Telli, qıyqacı çadralı başını balkonun sütununa söykəyib baxırdı.* S.Hüseyn. *Rüstəm kişi ikimərtəbəli binanın kərpic sütunundan*

*tutdu*. M.İbrahimov. // *məc*. İstinadgah, əsas, dayaq. [Kəndli:] *Ey ağalar, düzünü axtarsanız, hökumətin sütunu biz kəndlilərlə o qantər içində yük daşıyan fəhlələrdir.* S.S.Axundov. *Köhnə yaşayışın əsas sütunları yıxıldı.* T.Ş.Simurq.

2. Qəzetdə, kitabda və s.-də səhifənin yuxarıdan aşağıya doğru bölünmüş hissələrindən hər biri. *Müdir cənablarının bu cür tərifi qəzetin bir uzun sütununu doldurub*. C.Məmmədquluzadə. *Sabaha çırpınan fikirlərimi; Milyonlar oxuyur sütunlarında.* B.Vahabzadə.

3. *məc.* Aşağıdan yuxarıya dikələn, qalxan şey haqqında. *Yanğından qalxan tüstü sütunu.* – *Sütun kimi dikəlmiş bir başdaşı*. A.Səhhət. *Alovun işığı samovardan qalxan buxara əks edərək, masadan tavana qədər qızıl bir sütun təşkil edirdi.* H.Nəzərli.

**SÜTUNLU** *sif.* Sütunu, sütunları olan. *Sütunlu eyvan. İttifaqlar Evinin Sütunlu zalı.* – *Sütunlu binanın içində xüsusi və qaynar bir həyat başlamışdı.* S.Rəhimov.

**SÜTÜL** *sif.* 1. Hələ yetişməmiş, tamam dəyməmiş. *Sütül qarğıdalı.* – *Arpanı sütül, buğdanı ötür.* (Ata. sözü). *Sütül sünbüllər ağır başlarını əyib sanki biçinçini gözləyir*. Mir Cəlal. // İs. mənasında. [Gülməli:] *Gördüm ki, Toppuzlular məhəlləsindən bir tüstü, bir alov qalxır ki, gəl tamaşasına. Dedim, bəlkə bu tezdən sütül ütürlər.* Ə.Abasov.

2. Az bişmiş, alabişmiş. [Satıcı:] *Qovurma. Ay sütül ciyər kababı; Hər kimin pulu var, yeyər kababı*. M.Rahim. [Hatəmov Ümidə:] *..Sütül kababdan danışıb ağzımızı sulandırmaq istəyirsiniz?* B.Bayramov.

3. *məc.* Yeniyetmə, tər. *15 yaşını yenicə doldurmuş sütül gəlinlərə ancaq bu dairədə rast gəlmək olar*. Qantəmir. *Bu otaqların binasını qoyanda, yaxşı yadıma gəlir, mən lap sütül cavandım*. Mir Cəlal.

**SÜTÜLLƏNMƏ** "Sütüllənmək"dən *f.is.*

**SÜTÜLLƏNMƏK** *f.* Təzə-təzə yetişməyə başlamaq, tam yetişməmək, sütül halına gəlmək. *Arpa sütüllənib. Qarğıdalı sütüllənir.* – *Bu saat özünüzü Şamaxı yamaclarında, dəmyə zəmilərdə, adamboyu qalxan, sütüllənən* (f.sif.), *dəniz kimi ləpələnən sıx buğda sünbüllərinin arasında düşünün.* Mir Cəlal.

**SÜTÜLLƏŞMƏ** "Sütülləşmək"dən *f.is.*

**SÜTÜLLƏŞMƏK** b a x **sütüllənmək**.

**SÜTÜLLÜK** *is.* Sütül olma, yetişmək üzrə olan taxılın və s.-nin halı. *Qarğıdalının sütül mərhələsi. Taxıllar sütüllükdür.*

**SÜVAR** *zərf köhn.* [*fars.*] Ata və ya başqa heyvana minmiş. *Nagah bir süvar peyda oldu.* M.F.Axundzadə. *Baharın bir belə günlərinin birində əlvan çiçəklərlə bəzənmiş səhrada .. eşşəyə süvar bir cavan gedirdi*. E.Sultanov. ☐ **Süvar olmaq** – minmək. *Mollalar.. ağ eşşəklərə süvar oldular.* M.S.Ordubadi. [Rəşid:] *Dərhal Qurbanqulu əhvalatdan müxbir olub, ərizəni şəhərə aparıb, vəkillərə verməyi öhdəsinə götürdü və haman saat atına süvar olub yollandı.* T.Ş.Simurq.

**SÜVARİ** *sif.* [*fars.*] Ata minmiş, atlı. // *İs. mənasında.* Atlı əsgər. [Qartal:] *Mən öz odlu qılıncımla yüzə qədər süvarini biçib tökmüşəm..* M.Hüseyn. *Qızıl süvarilər isə qəti hücum gözləyirdilər*. H.Nəzərli. *Süvarilər Tülkü təpəsindəki camaata çatarkən ikinci zurnaçılar dəstəsi fəaliyyətə başladı*. P.Makulu.

**SÜYSÜN** *is.* Atlarda və digər qoşqu heyvanlarında boynun bel sütunu ilə birləşən hissəsi. [Koroğlu] *əlini atın süysünündən qoyub sağrısına qədər çəkdi.* "Koroğlu".

**SÜYÜM** *is. məh.* İnsan bədəninin quruluşu; qamət.

**SÜZƏLƏNMƏ** "Süzələnmək"dən *f.is.*

**SÜZƏLƏNMƏK** b a x **süzülmək** 2-ci mənada. *Mən istidən qan-tərin içində idim və bir yandan alnımın təri damcı-damcı axırdı və bir yandan da buz.. əriyib süzələnirdi*. C.Məmmədquluzadə. *Bir azdan* [Mirzənin] *ağ saqqalından son göz yaşları süzələndi*. S.Rəhimov.

**SÜZƏNƏK** *is.* [*fars.*] Sidik yollarına düşmüş qonokokk mikroblarının törətdiyi yoluxucu zöhrəvi xəstəlik; tripper.

**SÜZGƏC** *is.* 1. Bir şeyi süzmək üçün ələk və s. alət. *Süd süzgəci. Süzgəcdən keçirmək.* // Mayeləri və s.-ni lazım olmayan bərk hissəciklərdən, qatışıqlardan və s.-dən ayırıb təmizləmək üçün alət və ya maddə. *Tor süzgəc. Kağız süzgəc. Qum süzgəc.* – *Maye maddə bərk maddə ilə qarışıq halda isə, ..onu adi qıfda süzgəc kağızı vasitəsilə süzüb bərk mad-*

*dədən ayırırlar...* "Üzvi kimya". // *xüs*. Şüanı, cərəyanı və s.-ni saxlamaq və ya zəiflətmək üçün cihaz.

**SÜZGÜN** *sif.* Yarıaçıq, yarıyumulu. // Nazqəmzəli, nazlı, qəmzəli göz, baxış haqqında. *Sallanıb-sallanıb özünü öymə; Elə süzgün* (z.) *baxıb qəlbimə dəymə.* Aşıq Ələsgər. [Xəyyam:] *Sərpildi alov ruhuma süzgün baxışından; Sarsıldı bütün mənliyim, ey afəti-dövran.* H.Cavid. [Əhməd:] *Mən bunu onun baxışında, qara gözlərinin süzgün baxışında gördüm.* T.Ş.Simurq.

**SÜZMƏ[1]** "Süzmək"dən *f.is.*

**SÜZMƏ[2]** *is.* Suyu süzülərək qatılaşmış qatıq. *Tərs kimi qonaqlar da bir torba süzmə qatıqdan başqa bir şey gətirməmişdilər.* Çəmənzəminli.

**SÜZMƏK** *f.* 1. Mayeni qatışıqdan, xıltdan və s.-dən təmizləmək, saflaşdırmaq üçün süzgəcdən keçirmək. *Məhlulu süzmək. Nefti süzmək.* // Suyunu çıxarmaq, sudan ayırmaq. *Düyünü süzmək. Qatığı süzmək.* – [Göyçək] *şoru torbaya töküb süzdü.* Ə.Vəliyev.

2. Tökmək (ancaq içməli şeylər, xüsusən çay haqqında). *Miss Hanna.. ikinci çayı süzməyə başladı*. M.S.Ordubadi. *Nahardan sonra çayı Səkinə özü süzüb verdi*. Ə.Abasquliyev.

3. *məc.* Oynamaq, rəqs etmək. *Nərgizi üzüm, lay-lay; Yaxana düzüm, lay-lay; Sən böyü, mən qocalım; Toyunda süzüm, laylay.* (Bayatı). [Cahan:] *Toyunda da sənin, bala; Bax beləcə süzərəm*. Ü.Hacıbəyov. "*Nazbarı*" *deyil ki, yeniyetmələr süzsün, Pərizad xala bacarmasın*. Mir Cəlal.

4. Yarıqapalı gözlərlə baxıb nəzərdən keçirmək. *Başdan-ayağa süzmək. – Xəlil yuxusuzluqdan tutqunlaşmış qonur gözlərini qaldırıb, sərt və ağır baxışı ilə Şahmarı süzdü.* M.Hüseyn. *Kərim Hüseynağanı başdan-ayağa süzdü.* M.İbrahimov. *Nərgiz ..acizanə bir baxışla oğlanı süzdü.* B.Bayramov.

5. Qanad çalmadan sakit-sakit, səssiz uçmaq. *Təsbeh kimi qatarınız düzərsiz; Havalanıb ərş üzündə süzərsiz*. M.V.Vidadi. *Bu yerlərə gəlmiş quşlar .. çay üzərilə süzürdülər.* S.Rəhimov.

◊ **Gözlərini süzmək** – b a x **göz**.

**SÜZÜLMƏ** "Süzülmək"dən *f.is.*

**SÜZÜLMƏK** *f.* 1. Qatışıqdan, aşqardan və s.-dən təmizlənmək, süzgəcdən keçirilmək. *Məhlul süzüldü. Su süzüldü*. // Sudan ayrılmaq. *Qatıq süzüldü. Düyü süzülüb.*

2. Axmaq, damcı-damcı tökülmək, sızmaq. *Sarxan.. yanaqlarına süzülən* (f.sif.) *iri yaş damlalarını sildi*. M.Hüseyn. *Maya da özünü saxlaya bilməyib başını Səkinənin sinəsində gizlədərək süzülən* (f.sif.) *damcıları sildi*. M.İbrahimov. *Dinlə, meşədəki bulaq nə deyir? Baxma ki, süzülür o, gilə-gilə*. N.Xəzri. // Sızıb keçmək. *..Dan yeri sökülməyə başlayır, içəriyə işıq zolaqları süzülürdü.* M.Hüseyn. *Gülyanağa elə gəlirdi ki, göydən yerə süzülən* (f.sif.) *şəfəq Qəhrəmanlar kəndindəki gəncliyin, cavanların oxuduğu şən mahnının, qızların sevincinin, adamların məsud həyatının timsalıdır*. Ə.Vəliyev. *Günəşin ilk şüaları hisli bacadan içəri süzülərkən Fatı yorğanı üstündən götürüb tulladı.* Ə.Abasov.

3. Yarıyuxulu kimi olmaq; xumarlanmaq, axmaq (göz haqqında). *Yuxusuz maraltək hərdən süzülüb; Axan gözlərinin sədəqəsi canım.* Q.Zakir. *Nə gözəl süzülür qara gözlərin; Əcəba, onları süzmək vaxtımı?* M.Müşfiq.

4. Üzülmək, ilmələri qaçmaq, seyrəkləşmək. *Şalvarın dizləri süzülüb. Pencəyin qolları süzülmüşdür.*

**SÜZÜLMÜŞ** *f.sif.* 1. Süzgəcdən keçirilmiş (keçmiş). *Süzülmüş bal. Süzülmüş süd.*

2. B a x **süzgün**.

**SÜZÜNTÜ** *is.* Süzüləndən sonra qalan qalıq, xılt, torta və s. *Süzgəcdəki qalığı sıxıb süzdükdən sonra yeni süzüntü alırlar*. R.Əliyev.

**SVANLAR** *cəm* Qərbi Gürcüstan əhalisinin bir hissəsini təşkil edən xalq, dağlılar.

**SVETOFÓR** [*rus.*] Küçələrdə, yollarda hərəkəti nizama salmaq üçün qırmızı, sarı, yaşıl şüşələri olan elektrik siqnal fanarı. // Müxtəlif maşınlarda, qurğularda işıq siqnalı cihazı. *Lokomotiv svetoforu.* – [Qız:] [Tahir] *bizi saymadı, biz də gərək* [Tahirin] *svetoforunu bağlayaq.* M.Hüseyn.

**SVEV** *is.* [*lat.*] Eramızdan əvvəl I əsr – eramızın II əsrində yaşamış bir sıra qədim German tayfalarının ümumi adı.

**SVÍTER** [*ing.* sweater – tərləmək] Başdan geyilən döşübağlı, hündür boyunluqlu toxunma yun köynək – fufayka.

# Şş

**Ş** Azərbaycan əlifbasının iyirmi altıncı hərfi. B a x **şe.**

**ŞABALID** *is.* 1. Qoz, fındıq cinsindən qabıqlı meyvə və bu meyvənin ağacı. *Şabalıdın çox dadlı, qidalı meyvələrindən və ağaclarının oduncağından geniş surətdə istifadə edilir. Meyvələri çiy, qovrulmuş və bişirilmiş halda işlədilir.* İ.Axundzadə. *Yarımişıqlı otağımızın ortasında dördbucaq şəklində qayrılmış ocağın dövrəsində döşəkcələrə düzülüb oturardıq, .. şabalıd qovurardıq.* Çəmənzəminli.

2. Qəhvəyi, şabalıdı. *Şabalıd rəngli. Şabalıd rəngli şal. – Nazlı əynindəki tünd şabalıd rəngli ipək köynəyini çıxartdı...* S.Rəhimov.

◊ **Şabalıd cinsi** – çox xəsis, xeyirverməz adam haqqında. *Bu yerlərin dağı yox; Bağçası var, tağı yox; Cinsi şabalıd cinsi; Görkəmi var, yağı yox.* (Bayatı). **Şabalıddan yağ çıxartmaq** – mümkün olmayan şeydən də fayda görməyə çalışmaq.

**ŞABALIDI** *sif.* Şabalıd rəngində, qəhvəyi. *Şabalıdı saç. Şabalıdı saqqal. – Mir Məhəmməd Kərim ağa şabalıdı rəngli, qolsuz əbasını çiynindən endirib ayağa durdu.* Mir Cəlal. *Azacıq sonra Həmzə .. başında şabalıdı Buxara papağı olduğu halda .. otağın yuxarı başında dayandı.* Ə.Əbülhəsən. [Güləsərin] *yemlik yeməkdən əlləri və dodaqları bir az qaralıb, şabalıdı rəngə düşmüşdü.* İ.Şıxlı.

**ŞABALIDLIQ** *is.* Çoxlu şabalıd ağacı bitən yer, şabalıd meşəsi.

**ŞABAŞ** *is.* [*fars.*] Toy məclislərində oynayanlara xanəndə və çalğıçılar üçün verilən pul. *Gənclər oynayanda yoldaşları onların başına kağız pul* (*əsginas*) *şabaş tökərdilər.* H.Sarabski. *..Xanəndə çalar, cavanlar oynar, şabaş toplanar.* R.Əfəndiyev. *Bəzən oynayanlar utanıb şabaş almırdılar.* S.Rəhman.

**ŞABLON** [*alm.*] 1. Ülgü, qəlib. // Hazır məmulatın formasını yoxlamaq üçün alət.

2. *məc.* Çeynənmiş, bayağı, basmaqəlib. *Aydının fikrincə, şair adi və şablon sözdən qaçıb, təzə bir istilah yaratmışdı.* M.Hüseyn.

**ŞABLONLUQ** *is.* Şablon, çeynənmiş, bayağı şeyin halı; adilik, bayağılıq.

**ŞAD** *sif.* [*fars.*] 1. Sevinən, şən, fərəhli, məmnun. *Şad adam. Şad üz. Şad gözlər. Könlü şad olmaq. – Daşdəmir əmi öz tütünü barəsində belə tərifləri çox eşitmiş olduğunu göstərən şad bir səslə dedi.* M.Rzaquluzadə. ☐ **Şad etmək (eləmək, qılmaq)** – sevindirmək, fərəhləndirmək, şadlandırmaq, məmnun etmək. *Cövrlər kim, eyləmişdin birbəbir yad eyləyib; Şami-hicran könlümü bu növ ilə şad eylərəm.* S.Ə.Şirvani. *Bəzədin sən bu gün bizim çəməni; Şad qıldın bu gəlməginlə məni.* M.Ə.Sabir. *Məni unutmayın, tez-tez yad edin; Bu küskün könlümü sizsə şad edin.* M.Rahim. **Şad olmaq** – sevinmək, şadlanmaq, fərəhlənmək, məmnun olmaq. *Ələsgərəm, şad olmadım dünyada; Səni gördüm, dərdim oldu ziyada.* Aşıq Ələsgər. [Rzaquluxan:] *Qızım, çox şad oluram ki, sənə xərc etdiyim pullar hədər getməyibdir.* M.S.Ordubadi.

2. Ürəkaçan, fərəhli, sevindirici, xoş. *Şad xəbər.* // Zərf mənasında. *Çünki bilir rahət əziyyətdədir; Şad yaşamaq səydə, qeyrətdədir.* M.Ə.Sabir.

3. **Şadəm (şadam)** şəklində – sevinirəm, məmnunam (bir şeydən şad, məmnun olmağı bildirir). *Yarın xəyalilə bu gün mən şadəm; Qəribliyə düşsəm qan ağlar didəm.* M.P.Vaqif. *Bu gün şadam, oxuyuram, çalıram; Sən yaşa dolduqca mən ucalıram.* Aşıq Hüseyn.

◊ **Şadlığından yerə-göyə sığmamaq (sığışmamaq)** – hədsiz sevinc içərisində olmaq, şad olmaq, sevinmək, şadlıq eləmək. *Şadlığından sığışmayıb yer ilə göyə; Öz eşqini övlad kimi bağrına basır.* S.Vurğun.

**ŞADARA** *is.* Buğdanın, arpanın zibilini, torpağını təmizləmək üçün xəlbir. ☐ **Şadara kimi** – deşik-deşik, dəlik-dəlik. *İynə vurdurmaqdan bədəni şadara kimidir.*

**ŞADARALAMA** "Şadaralamaq"dan *f.is.*

**ŞADARALAMAQ** *f.* Şadaradan keçirmək, şadarada təmizləmək. *Buğdanı şadaralamaq.*

**ŞADARALANMA** "Şadaralanmaq"dan *f.is.*

**ŞADARALANMAQ** *məch.* Şadaradan keçirilmək, şadarada təmizlənmək.

**ŞADƏNƏ** *sif.* İri dənələri olan, iri dənəli. *Şadənə noxud. Şadənə buğda. – Bildirçin yediyi adi darı olardı. Arabir şadənə də verərdilər ki, quş qızışsın.* H.Sarabski.

**ŞADXƏBƏR: şadxəbər olasan!** – xoşxəbər gətirən adama qarşılıq olaraq deyilən təşəkkür ifadəsi. [Xavərnisə:] *Şadxəbər olasan! Ağlamıram, soğan şoqəribin acısıdır ki, gözlərim yaşarmışdır*. T.Ş.Simurq.

**ŞAD-XÜRRƏM** *sif.* və *zərf* [*fars.* və *ər.*] Çox şad, kefi kök, sevinc içərisində. [Odabaşı:] [Oğlan] *hər yerdə özünü şad-xürrəm .. lətifəgu göstərirdi*. Ə.Haqverdiyev. *Axırda hamı şad-xürrəm yıxılıb yatdı*. S.S.Axundov. *Qız xoşbəxt, oğlan xoşbəxt – ikisi də əl-ələ verib şad-xürrəm, diriliyin geniş bağında ömür sürürdülər*. Çəmənzəminli.

**ŞADLANDIRICI** *sif.* Sevindirici, fərəhləndirici; şadlıq gətirən, sevinc gətirən, şadlandıran, sevindirən, ürəkaçan. *Şadlandırıcı xəbər*.

**ŞADLANDIRMA** "Şadlandırmaq"dan *f.is.*

**ŞADLANDIRMAQ** *f.* Şad etmək, sevindirmək, fərəhləndirmək, ürək açmaq. *Bu xəbər bizi olduqca şadlandırdı. – Məktub Hacını həddindən artıq şadlandırdı*. M.S.Ordubadi.

**ŞADLANMA** "Şadlanmaq"dan *f.is.*

**ŞADLANMAQ** *f.* Şad olmaq, sevinmək, fərəhlənmək. *Rüstəm Hümmətəlinin vəhşi çəngəlindən xilas edilmiş Gülzara baxdıqda şadlanır*. T.Ş.Simurq. *Gəl ki, sən gələndə şadlanır ömür; Gül açır gəncliyin dili, ağızı*. S.Vurğun.

**ŞADLIQ** *is.* Sevinc, fərəh. *Dağıldı bu şadlıq xəbəri, dərbədər oldu; Yandı oda qəmlər*. M.V.Vidadi. *Öz musiqi və sənəti ilə, özünün dilrüba səsilə minlərin şadlığına səbəb olan bu tarixi sima ömründə kədərdən başqa bir mükafat qazana bilmədi*. M.S.Ordubadi. // İnsana fərəh, sevinc, məmnunluq verən hadisə, şey; nəşə, kef, əyləncə, toy, bayram. [Mərcan bəy qonaqlara:] *Oturun burada, yeyin, için, kef çəkin. Bu gün şadlıq günüdür, gərək şad olasınız*. Ü.Hacıbəyov. [Vəzir:] *Şadlıq dəmi çatdı, durun! Şahanə bir məclis qurun!* A.Şaiq. ☐ **Şadlıq eləmək (etmək)** – çalıb-oynamaq, əylənmək, kef eləmək, şadlanmaq. *Toydan qabaq gəlinin başına və əl-ayağına xına yaxardılar. O gecəni səhərədək dəf, dumbul çalıb, oynayıb şadlıq edərdilər*. H.Sarabski.

**ŞADLIQLA** *zərf* Sevinclə, sevincək, fərəhlə, şad halda, məmnuniyyətlə. [Hüseynqulu:] *Birpərdəli bir vodevil belə yazılsaydı, təzə olduğundan çox şadlıqla oynardıq*. H.Sarabski. *Naznaz telini geri itələyib Qaraşa baxaraq şadlıqla gülümsədi*. M.İbrahimov. *Sərvinaz cavan ərinə şadlıqla baxıb gülümsədi*. İ.Əfəndiyev.

◊ **Şadlıqla qalın!** – birilə ayrılarkən deyilən xoş arzu ifadəsi. **Şadlıqlarda görüşək!** – matəm yerində birilə görüşərkən deyilən arzu ifadəsi.

**ŞADMAN** *sif.* və *zərf* [*fars.*] *klas.* Şad, sevinc, məmnun. *Durdu qazi şahə vida etdi; Evinə xeyli şadman getdi*. S.Ə.Şirvani. *Olmadım hiç şadman, əfsus!* X.Natəvan. [Odabaşı:] *Dostu, Fərmanı bir növ şadman görüb yəqin etdi ki, əhvalatdan xəbəri yoxdur*. Ə.Haqverdiyev.

**ŞAD-ŞAD** *zərf* Sevinə-sevinə, sevinc içərisində, fərəhli, məmnun halda. *Məktub alanlar şad-şad çəkildi, almayanlar sakit-sakit addımladı*. S.Rəhimov.

**ŞAD-ŞALAYIN** *dan.* b a x **şad**. [Ana] *sonra bişirdiyi xörəyi ortalığa gətirdi. Şad-şalayın yeyib qurtardı*. Ə.Vəliyev.

**ŞADYANA** *sif.* Şadlıqla, sevinclə, məmnunluqla. *Şadyana qəbul. Şadyana məclis*.

**ŞADYANALIQ** *is.* Şadlıq, şənlik, bayram. [Rüstəm bəy:] *Məşədi İbad, mən sənin qohumluğunu özüm üçün böyük bir fəxr bilirəm. Ona görə bir balaca şadyanalıq edək*. Ü.Hacıbəyov. // *zərf* Sevinə-sevinə, şadlıqla. *Bir dəstə arvad-uşaq şadyanalıq ilə səslənib, gələnlərin qabağına çıxdılar*. Mir Cəlal.

**ŞAFRÁN** [*ər.*] Sarı-qırmızı meyxoş alma növü.

**ŞAFTALI** *is.* [*fars.*] Qabığı hovlu, sarı-qırmızı rəngli, iritumlu, şirəli meyvə. *Şaftalı gəlməmiş tabağı gəldi*. (Məsəl). *Şaftalı, ərik və tut ağacları baş-başa verərək günün qabağını çətir kimi tutur, yaşıl otların, tər yoncanın üzərinə sərin kölgə salırdı*. İ.Əfəndiyev. // Şaftalıdan bişirilmiş, hazırlanmış. *Şaftalı mürəbbəsi. Şaftalı cemi*.

**ŞAFTALILIQ** *is.* Şaftalı ağacları əkilmiş yer, şaftalı bağı.

**ŞAGİRD** *is.* [*fars.*] 1. İbtidai və ya orta məktəbdə oxuyan uşaq; məktəbli. *Məşədi bütün sinifdə ən yaxşı oxuyan şagirdlərdəndir*. M.Hüseyn. *Teymur müəllim şagirdlərə vətənpərvər bir ruhun tərbiyə olunmasına çox əhəmiyyət verirdi*. Ə.Sadıq.

2. Hər hansı bir usta yanında sənət, peşə öyrənən gənc. *Dərzi şagirdi. Çilingər şagirdi.* – [Cavan oğlan:] *Qardaş, – dedi, – burada o kişinin naibi olmamış olmaz! – Var, – dedilər, – burada şagirdi var.* Mir Cəlal.

3. Birinin təliminə, məsləkinə, əqidəsinə, işinə tərəfdar olan və onun işini davam etdirən şəxs.

**ŞAGİRDLİK** *is.* 1. Şagird olma, şagird həyatı, məktəbdə oxuma, tələbəlik. *Şagirdlik illəri.*

2. İxtisas təlimi. *Fabrik-zavod şagirdliyi.*

**ŞAH**[1] *is.* [*fars.*] 1. Keçmişdə İran və Əfqanıstanda padşahın, hökmdarın titulu, həmçinin bu titulu daşıyan şəxs. [Vəzir:] *Qorxma, sənin duan şahın üstündədir.* Ü.Hacıbəyov. *İmamlar, nəbilər, sultanlar, şahlar; Min il at oynatdı kürəyimizdə.* S.Vurğun.

2. Şahmat oyununda: baş fiqur.

3. *məc.* Ən birinci, ən yaxşı, ən nümunəvi. *Formanın kamilliyi və əsərin bütün ünsürləri arasındakı bədii vəhdətə gəldikdə isə "Ölülər" Azərbaycan dramaturgiyasının şah əsəri sayıla bilər.* M.İbrahimov. // Obrazlı təşbehlərdə: seçilən, başda duran, birinci yeri tutan. *Gözəllər sultanı, mələklər şahı; Ala gözlü xanım, getmə, amandı.* Aşıq Ələsgər. *Qızılgül şahıdır bütün güllərin; O hələ qönçədir, yuxusu dərin.* N.Rəfibəyli.

4. Arı ailəsində dişi arıya deyilir. *Piri kişi Ağca xanıma dedi: – Hər yuvada bir dişi arı olar, ona şah deyərlər.* S.S.Axundov.

◊ **Şah(ın) tənbəli** – çox tənbəl, özünü zəhmətə, canını işə vermək istəməyən adam haqqında. [Bahar:] *Gör mən necə yaxşı arvadam ki, sənin kimi şah tənbəlinə çarıq alıram.* Ə.Haqverdiyev. [Ballı və Xallı:] *Ay qağa, vallah, özciyəzləri şah tənbəlidirlər.* S.Rəhimov.

**ŞAH**[2] Atın dal ayaqları üstündə qalxıb durması. ☐ **Şahə qalxmaq** – iki dal ayaqları üstə qalxıb durmaq (at haqqında). *Köhlən at şahə qalxdı.* M.Hüseyn. [İlyas Adiləyə:] *Tərlan kişnəyib şahə qalxır, sonra irəli atılıb düşmən əhatəsini yararaq məni götürüb qaçır.* Ə.Məmmədxanlı. *At birdən şahə qalxdı.* M.Rzaquluzadə.

**ŞAHAD** *is.* Dəyirmanda üyüdülən taxıl üçün alınan haqq; dəyirman haqqı. *Dəyirmanda dənim yox, şahad üstə başım yarılır.* (Ata. sözü). [Dəyirmançı yüzbaşıya:] *Varımıyoxumu apardılar, bilirsən ki, əkinim yox, biçinim yox, şahadla dolanıram, yeyənim də yeddi başdır.* Çəmənzəminli.

**ŞAHANƏ** *sif.* [*fars.*] Şaha, şahlığa məxsus və ya şaha, hökmdara layiq. [Vəzir:] *Sonra üzün dörd nəfər hazırda olan pişxidmətlərə tutub dedi ki, xələti-şahanəni gətirin, qibleyi-aləmi geyindirin.* M.F.Axundzadə. [Vəzir:] *Şadlıq dəmi çatdı, durun; Şahanə bir məclis qurun.* A.Şaiq. // *məc.* Çox nəfis, çox mükəmməl.

**ŞAHANİ** b a x **şahanə**. *Gözəl gül, şahani gül; Ləbi gül, dəhani gül; Öz gülümü istərəm; Bürüsə cahani gül.* (Bayatı).

**ŞAHBAL** b a x **şahpər**.

**ŞAHBAZ** *is.* [*fars.*] 1. Tərlan, şahin. *Ələsgər, torunu sən tərlana qur; Bəlkə tora düşən bir şahbaz ola.* Aşıq Ələsgər. *Qızılcadır soyuq bulaq yaylağı; Bərələri şahin, şahbaz oylağı.* Aşıq Dilqəm.

2. *məc.* İgidliyi, qoçaqlığı, cəsarəti ilə fərqlənən adam haqqında. *Çanaqqala, Sarıqamış; İgidləri şahbaz gördüm.* "Koroğlu". // *məc.* Xalq şerində məğrur gözələ işarə. *Vaqifi atəşi-hicran öldürdü; Aman, verin o şahbaza bir xəbər.* M.P.Vaqif. // Şairanə təşbehlərdə: gözəlin məğrur gözlərinə, baxışına işarə. *O şahbaz gözlərini görəndə; Uçar mürği-ruhum, durmaz bədəndə.* Q.Zakir. *O mələk simalım, şahbaz baxışlım; O dodağı ballım, ceyran yerişlim.* S.Vurğun.

**ŞAHBEYT** *is.* [*fars.* şah və *ər.* beyt] Şerin birinci beyti, mətlə; həmçinin bir şerin ən gözəl, seçilmiş beyti.

**ŞAHDAMAR** *is.* 1. B a x **aorta**.

2. *məc.* Ən mühüm, ən əsas, başlıca yol.

**ŞAHƏNŞAH** *is.* [*fars.*] 1. *tar.* 1979-cu il İran islam inqilabına qədər İran şahlarının titulu. *Şücaiddövlə imperator hökuməti ilə şahənşah hökuməti arasında keçilməsi mümkün olmayan bir uçurum yaratmışdı.* M.S.Ordubadi.

2. *məc.* Başçı, padşah. [Qaz:] *Bəs mənəm quşların şahənşahı; Durna oldu bu nəqlin agahı.* S.Ə.Şirvani.

**ŞAHI** *is.* [*fars.*] *köhn.* Beşqəpiklik qara pul (adətən saylarla). *Abbasını bəyənməyən beş şahı çıxardar.* (Ata. sözü). [Hacı Qara:] *Bu*

*kasad bazarda mənim bir şahı qazancım yoxdur, abbasını haradan alıram?..* M.F.Axundzadə. [Mərcan bəy:] *Cibimdə beş-altı şahı var, o da özümə lazımdır.* Ü.Hacıbəyov.

**ŞAHİD** *is.* [*ər.*] 1. Bir hadisəni, əhvalatı, işi öz gözü ilə görmüş və ya görən adam. *Mən bu hadisələrin şahidiyəm. – Mənim sakin olduğum otağın üzü* [Sarıköynəkgilin] *həyatinə olduğu üçün hər işinə şahid olurdum.* S.Hüseyn. *Onsuz da evin hər tərəfində keçmiş vuruşmaların şahidi olan bir çox uçuq-söküklər var idi.* H.Nəzərli. *Mən bir çox belə hadisələrin nəinki şahidi, hətta bir neçə dəfə iştirakçısı da olmuşam.* M.Rzaquluzadə.

2. Özünə məlum olan bir iş haqqında şəhadət vermək üçün məhkəməyə çağırılan şəxs. *Şahidləri dinləmək. – Dava üçün bir qazı, isbat üçün min şahid.* (Ata. sözü). [Səfər Həmzəyə:] *Ağa, şahidlərin biri mən.* C.Cabbarlı. *İslam, ərizəsində bir çox şahidlər göstərirdi.* S.Hüseyn. *Şahid lazım olmadı, çünki Şəfiqə özü boynuna götürdü.* İ.Musabəyov. □ **Şahid çağırmaq (çəkmək, göstərmək)** – bir şeyin həqiqətən olub-olmadığını sübut etmək üçün rəsmi şəkildə adam göstərmək, ona isnad etmək. *Uçurub kökündən nəmli zindanı; Şahid çağıraram bütün dünyanı.* S.Rüstəm. *Qədir üzünü qonşulara tutub şahid çəkirdi.* Mir Cəlal. **Şahid durmaq (olmaq)** – öz gözü ilə gördüyü bir şey, hadisə haqqında ifadə, məlumat verməklə onun doğru olub-olmadığını göstərmək. [Çimnaz Səriyyəyə:] *Özüm gedib şahid duraram ki, sən özün-özünü öldürmüşsən.* C.Cabbarlı. [Maral:] *Sözlərini təkrar elə, Mirzə Qərənfil mənim şahidim olacaq.* S.Rəhman.

**ŞAHİDLİK** *is.* 1. Gözü ilə gördüyü və ya bildiyi bir hadisə və ya iş haqqında bir şəxsin məlumat verməsi, şahid durması.

2. Bir şeyin həqiqiliyini, düzlüyünü rəsmən təsdiq etmək üçün bir işdə iştirak etmə. *O günün sabahı Şərifzadə və Qəmər xanımın şahidliyi ilə Zeynalın Mehribanla yenidən evlənməsi zaqsda qeyd olundu.* S.Hüseyn.

3. Məhkəmədə: şahidin verdiyi məlumat; şəhadət. *Şahverdi yalançı şahidlik eləyib çox adamı nahaqdan tutdurubmuş.* İ.Əfəndiyev.

**ŞAHİD-SÜBUT** *is.* [*ər.*] Sübut edən şey, dəlil. *Mənə şahid-sübut lazım deyil. – Göy guruldadı, tufan qopdu, ildırım çaxıb evimi, mülkümü yandırdı. Ondan qalan bu kömür parçalarıdır ki, onu da şahid-sübut kimi gətirmişəm.* "Kirpi".

**ŞAHİN** *is.* 1. Möhkəm əyridimdikli, uzun, itiqanadlı yırtıcı quş. *Şahin, şunqar sürbənizi dağıdar; Boyanarsız qızıl qanə, durnalar!* M.V.Vidadi. [Tərxan:] *Ovçu şahinə qırqovul neylər! Tükün qanlı caynağında didər!* A.Şaiq.

2. *məc.* Cəsur, mərd, igid, qorxmaz adam haqqında. *...Təbriz, inqilablar ocağı Təbriz; Aslanlar, şahinlər oylağı Təbriz.* Şəhriyar. // *məc.* Obrazlı təşbehlərdə. Təyyarə və təyyarəçilərə verilən təntənəli ad. *Bəzən də qartal kimi sən iki qanad üstdə; Şahinlərin qonduğu zirvələrə dayanır...* A.İldırım.

**ŞAHİNCƏSİNƏ** *zərf* Şahin kimi, qəhrəmancasına, mərdcəsinə, igidcəsinə, qorxmadan. *Hamı səbirsizliklə komanda gözləyir, bu saat şahincəsinə düşmənin üstünə şığımaq istəyirdi.* Mir Cəlal.

**ŞAHLIQ** *is. köhn.* 1. Padşahlıq, hökmdarlıq. // Şahın idarəsi altında olan məmləkət, torpaq və s. □ **Şahlıq etmək** *köhn.* – 1) padşahlıq etmək; 2) *məc.* hökmranlıq etmək, hökm sürmək. *Meşədə caynaqlı bir şir şahlıq eləyirdi.* S.Rəhimov.

**ŞAHMAR** *is.* [*fars.*] 1. Zəhərli, iri ilan cinsi. *İndi Kür boyunca, Araz boyunca; Gürzələr, şahmarlar çəkilir qına.* S.Vurğun.

2. Obrazlı təşbehlərdə: gözəlin saçına işarə. *Kəmənd kimi tökülübdür gərdənə; Dönübdür sərasər şahmara tellər.* M.P.Vaqif. *Zülfü şahmar, mina gərdən mötədil; Zəbərcəd kəlməli, misali-bülbül.* Aşıq Ələsgər.

**ŞAHMAT** *is.* [*fars.* "şah öldü"] 1. 64 açıq və tünd xanası olan taxta üzərində 16 ağ və 16 qara fiqurdan hər birini müəyyən qaydalarla hərəkət etdirərək oynanılan oyun. *Şahmat da həyat kimidir – mübarizəsiz və ehtirassız oynayanda ləzzət vermir.* M.İbrahimov. // Şahmat oyunu üçün fiqurlar komplekti. [Yusif şahmatı bir kənara itələyir:] *Həvəsim yoxdur. Qalsın sonraya.* M.İbrahimov. [Adil:] *Mən bütün şahmat fiqurlarının qabaqcadan əsaslı surətdə .. hərəkət etməsini istəyirdim.* İ.Əfəndiyev.

2. Şahmat taxtası kimi (xana-xana şəklində) olan. *Dəyirmi binanın ətrafındakı xiyabanın*

*qırmızı əqiq daşları şahmat taxtası şəklində döşədilmişdi.* M.S.Ordubadi. *Xüsusilə minaatanlar şahmat qaydasilə düz vurur, vzvodun bir addım da olsun irəli getməsinə aman vermirdilər.* Ə.Vəliyev.

**ŞAHMATÇI** *is.* Şahmat oyunçusu. *Məmun ehtiraslı .. şahmat həvəskarı idi. Orta asiyalı məşhur şahmatçı Rəb-rəbi sarayına gətirdərək tez-tez hüzurunda şahmat yarışları keçirərdi.* M.İbrahimov.

**ŞAHNAZ** *is.* [*fars.*] 1. Azərbaycanın klassik muğamlarından birinin adı. *Rüstəm bəyin həyəti. Pərdə qalxdıqda həyətdə Sərvər ilə Gülnaz görünür. Pərdədən qabaq musiqi çalınır. Sonra tarda* "*Şahnaz*" *çalınır.* Ü.Hacıbəyov.

2. Keçmişdə: zərli, ipək parça növünün adı. *Şahnazdan paltar tikdirmək.*

**ŞAHNİŞİN** [*fars.*] *köhn.* 1. Otağın küçə tərəfə çıxan pəncərəli çıxıntısı; erker. *Şahın taxtı şahnişində qoyulmuşdu.* P.Makulu.

2. Faytonda, arabada sürücünün oturduğu yer.

**ŞAHPƏR** *is.* [*fars.*] *klas.* Quş qanadının uzun tükləri, lələk; qanad. *Al məni şahpərin üstündə, apar balaya; Oradan ta ki həqarətlə baxım dünyaya.* A.Səhhət. *O dərinliklərə, boşluqlara uçduqca xəyal; Sanki çırpınmada bir şahpəri yanmış qartal.* H.Cavid. // Obrazlı təşbehlərdə. *Fikir, xəyal şahpərində çöllər keçər, dağlar aşar; Dərdinə tapmaz bir çarə, ona yalnız bir təsəlli.* A.Şaiq.

**ŞAHRAH** *is.* [*fars.*] Baş küçə, geniş əsas yol; magistral. // *məc.* Bir şeyin hərəkətində və ya inkişafında əsas xətt, istiqamət.

**ŞAHSÖYÜD** *is. bot.* Şoran torpaqlarda, düzəndə bitən söyüdəbənzər kol.

**ŞAHTƏRƏ** *is. bot.* Aran yerlərdə taxıl zəmilərində bitən və xalq təbabətində istifadə edilən bitki və onun çiçəyi.

**ŞAHTUT** *is.* Calaq edilmiş tut ağacı və onun meyvəsi. *Şahtut ağacı. – Xasay həyətdəki şahtutun altında oturub, fikirdən aralana bilmir, bu dəqiqələr özünü cəbhədə hiss edirdi..* Ə.Vəliyev.

**ŞAHZADƏ** *is.* [*fars.*] Şah oğlu və ya padşah ailəsindən olan şəxslərin övladlarından biri. *İkinci otaq da fərşlə döşənmişdi və divarlarında Səfəviyyə nəslindən vəfat edən padşahların və namdar şahzadələrin təsviri çəkilmişdi.* M.F.Axundzadə. *Bağdadı iflas edən tacirlər, şahzadələr, xəlifə ailələri minlərcədir, qiymətli şeylər də bunların əlindədir.* M.S.Ordubadi.

**ŞAX** 1. *is.* Ağacdan, koldan ayrılan budaq, qol; dal. *Ağacdan iki şax ayrılıb. Pambıq kollarının şaxı. – Quşlar qayıdıb oxur təranə; Şaxlarda tikirlər aşiyanə.* A.Şaiq. [Əmiraslan Nurəddinə:] *O əlin ilə tutduğun budağın başında gör nə çox gilas var, çıx o şaxı sındır.* S.S.Axundov.

2. Ağacın qırılıb yerə tökülmüş yarpaqlı qol-budağı. *Kəlbalını yolun qırağında şax, şəvəlin içərisində zarıyan bir halda tapmış və götürmüşdülər.* S.Rəhimov.

3. *məc.* Soyuqluq, şaxta. *Gün çıxdı, havanın şaxı sındı. – Havaların şaxı sındığından bu tərpəniş Muzdura çox ılıq gəlirdi.* Ə.Əbülhəsən.

4. *sif.* Hamar, düz; əzgin olmayan. *Şax paltar. – Soydular Hacının şax paltarını; Tüfəngtapançanı, üç qatarını.* H.K.Sanılı. *Yazarsanmı, ay komandir, bax, kağız da tapmışam; Şeri bina köçürməkçin şax kağız da tapmışam.* Z.Cabbarzadə.

5. *sif.* Düz, sərrast, dümdüz, dik. ..[Şərəf] *qələmə ağaclar kimi şax və nazikbədənli Şirzadı içəri buraxdı.* M.İbrahimov. *Məmmədcəfər Məmmədəlidən bir yaş böyük, uzunboylu, şax, qüvvətli bir kişi idi.* S.Rəhman. ☐ **Şax durmaq (dayanmaq)** – düz durmaq, özünü dik saxlamaq. *Soldatlar şax durub çest verirdilər.* Ə.Haqverdiyev. *Qadın diksinmiş kimi düzəlib şax durdu.* Mir Cəlal.

◊ **(Üzünə) şax baxmaq** – cəsarətlə, çəkinmədən, qürurla baxmaq. **Özünü şax tutmaq** – qürurlu, təşəxxüslü olmaq. [Gülara] *özünü şax tutardı.* İ.Əfəndiyev. *..Fərman özünü elə şax tutardı ki, elə bil, atasına tapşırılan işin yarısını o görəcəkdi.* Ə.Sadıq. **Sözü şax (üzünə) demək** – birinin yanında heç bir eybi, utanılacaq işi olmadığına görə sərbəst halda fikrini demək, çəkinmədən sözünü demək. [Nəsir] *hər kəsin çirkin əməlini şax üzünə deyərdi.* S.S.Axundov. [Surxayın] *sözü .. şax deməsi Həsən kişiyə ləzzət verirdi.* M.İbrahimov. ..[Usta] *yaramaz işlərinin üstünü açır, nöqsanlarını şax üzünə deyirdi.*

M.Hüseyn. **Şax gəzmək** – heç kəsin yanında eybi, qəbahəti, nöqsanı olmadığına inandığı üçün özünü alnıaçıq, başıuca, dikbaş aparmaq. [Fərman:] *Bilirsiniz, həmişə şax gəzmiş bir adamam, indi məni əmim götürüb elə yerə çırpıbdır ki, xəcalətimdən insan arasına çıxa bilməyirəm.* Ə.Haqverdiyev. *Elə buna görə də* [Babacan] *hələ şax gəzir, açıq danışır, özünə isnad olunan bir çox nöqsanları boynuna götürmür*(*dü*). Ə.Əbülhəsən. **Üzünə şax baxa bilməmək** – birinin yanında qüsuru, günahı olduğu üçün ondan utanmaq, xəcalət çəkmək. [Səmirə:] *Nə uşaqların, nə də qayınanamın üzünə şax baxa bilirdim.* M.Hüseyn. **Üzünə şax baxmaq** – birinin yanında eyibli işi, qəbahəti olmadığı üçün özünü onun qabağında sərbəst hiss etmək, ona qürurla, cəsarətlə baxa bilmək. [Qulu:] *Deyirəm, Cimi, vicdanın olsun, elə elə ki, mən də sənə əməkgünü yazanda utanıb tər tökməyim. Camaatın üzünə şax baxım.* İ.Əfəndiyev.

**ŞAX-BUDAQ** *top.* Ağacın iri budaqları, şaxələri. *Getdi meşə içrə odun qırmağa; Şax-budağı başladı sındırmağa.* A.Səhhət. [İlyas Adiləyə:] *Mən əzilmiş kol-kosları, sınıq şax-budaqları gördüm, lakin Tərlanı görə bilmədim.* Ə.Məmmədxanlı. □ **Şax-budaq atmaq** – b a x **şaxələnmək**.

**ŞAX-BUDAQLI** *sif.* İri şaxları, budaqları, qolları olan. *Şax-budaqlı ağac.* – *Münbit və səxavətli torpaq bu, cəmisi yarım hektarlıq yerdə elə qüvvətli, şax-budaqlı ağaclar yetişdirmişdi ki, payızda meyvəsini yığıb-yığışdırmaq olmurdu.* S.Rəhman. [Qaçaqlar] *yerli-yataqlı, şax-budaqlı qocaman bir çinarın dibində doyunca yeyib, al şərabdan içmiş, yatıb xumarlanırdılar.* M.Rzaquluzadə. // Şaxəli, şaxələnmiş, haçalanmış. *Maral yüyürdükcə tez-tez büdrəyir, şax-budaqlı buynuzları ağaclara toxunurdu.* M.Hüseyn.

**ŞAXƏ** b a x **şax** 1-ci mənada. *Fərivər külələri, gecənin qaranlığından istifadə edərək çiçəklərlə ötüşdüyü zaman, haqquşu da çinarların şaxələrində şirin yuxuya dalan minlərcə quşların ninnisini oxuyurdu.* M.S.Ordubadi. *Ötürdü şaxədə şur ilə bülbül.* M.Rahim.

**ŞAXƏLƏNMƏ** "Şaxələnmək"dən *f.is.*

**ŞAXƏLƏNMƏK** *f.* Şaxələrə, qollara ayrılmaq, şaxə vermək. *Dəfələrlə* [ağacın] *budaqları kəsilsə də, yenə şaxələnib, qol-qanad açıb bar gətirirdi.* Ə.Vəliyev. *Toplandı bir yerə çaqıl, kirəc, su; İşçi qüvvəsilə şaxələndilər.* M.Müşfiq.

**ŞAXƏLİ** *sif.* Şaxələri olan, qollu-budaqlı. *Şaxəli ağac.* – *Şaxəli sünbülün, yerin sirdaşı; Polad da əridir alovda, odda.* S.Vurğun.

**ŞAXIMA** "Şaxımaq"dan *f.is.*

**ŞAXIMAQ** *f.* Güclü təsir etmək, vurmaq. *Qarabağın isti günü şaxıdıqca az qala ağızlarda dili də qurudurdu.* Ə.Vəliyev. [Nuriyyə:] *Gün dik adamın təpəsindən şaxıdığından biz qayıdıb otağa girdik.* İ.Əfəndiyev. [Fizzə xanım:] *Nə yağış yağır, nə gün şaxıyır, amma* [Nisə xanım] *gərək aerodroma da yapon çətiri ilə gələ..* Ə.Məmmədxanlı.

**ŞAXİS** *is.* [*ər.*] *geod.* Yer səthi nöqtələrinin nisbi yüksəkliyini təyin etmək üçün alət; nivelir.

**ŞAXLAMA** 1. "Şaxlamaq"dan *f.is.*

2. Ağacın qurumuş qol-budağını kəsmə. *Söyüdü şaxlama.*

3. Torpağa şax ilə (1-ci mənada) mala çəkmə. // B a x **şaxmala**.

**ŞAXLAMAQ** *f.* 1. Ləklərə şax vurmaq, ləkləri şaxla ayırmaq.

2. Şax döşəmək, şaxla örtmək. *Xəndəyin kənarlarını şaxlamaq. Barama qurdunun üstünü şaxlamaq.*

**ŞAXLANMA** "Şaxlanmaq"dan *f.is.*

**ŞAXLANMAQ** *f.* 1. Lovğalanmaq, təkəbbürlənmək, iddialanmaq, kəkələnmək. [Xudayar bəy övrətinə:] *Dədən evindən mənə çox dövlətlər gətirmisən, bir az da şaxlan mənim üstümə.* C.Məmmədquluzadə. *Lal Hüseyn ürəklənib şaxlandı.* M.İbrahimov.

2. Şax dayanmaq, dikəlmək. *..Kəyan ayağa qalxdı və ufultu ilə bir şaxlanıb belini dikəltdi.* Ə.Əbülhəsən. // Dal ayaqları üzərinə qalxmaq, şahə qalxmaq (at).

**ŞAXLI** *sif.* 1. Şax, şaxı olan, qatlanmamış. *Şaxlı parça.* – [Ərən:] *Mariqerini hamama aparıb, ona uzun ipək paltar, şaxlı ipəkdən ləçək verdilər.* Çəmənzəminli.

2. Şaxı, qolu olan, qollu-budaqlı. *Şaxlı ağac.* – *Girib belləmədi bir dəfə bağı; Qurutdu susuzluq şaxlı budağı.* M.Dilbazi.

**ŞAXLI-BUDAQLI** *sif.* Çoxlu şaxı, budağı olan, qollu-budaqlı. [Nurəddin] *yoldan bir*

*az kənar bir şaxlı-budaqlı ağac tapıb üstünə çıxdı ki, orada gecə yatsın.* S.S.Axundov.

**ŞAXLIQ** *is.* Şax şeyin (parçanın) halı. *Paltara şaxlıq vermək üçün nişastalayırlar.*

**ŞAXMALA** *is.* Şaxlardan düzəldilmiş primitiv mala.

**ŞAXSEY** *nida.* Fəlakətli, dəhşətli, faciəli bir hadisə qarşısında çıxarılan fəryad səsi. *Şəhərin arvadları dəstə-dəstə Hacının böyük bacısı Pərinisanın evinə dolub boşalmaqda idilər. Şaxsey və şivən səsi asimana bülənd olmuşdu.* Ə.Haqverdiyev. [Heydər bəy:] *..Bizimkilər də şaxsey deyə, saçlarını yolurlar.* S.S.Axundov. □ **Şaxsey vurmaq (təpmək, getmək)** – yasda, məhərrəmlikdə ölü üçün saç yolmaq, fəryad qopararaq ağlamaq. [Fatma xanım:] *Sənin kimi oğlun paltarın töküm, üstə şaxseyni təpim.* N.Vəzirov. [Səttar:] *Məhəlləmizdə şaxsey gedəcəklər, – dedi. – Gəlin, biz də gedib baxaq.* P.Makulu.

**ŞAXSEY-VAXSEY** *is. din.* Məhərrəmlikdə: imam Hüseynin qətli günlərində şiələrin mərsiyə, növhə oxuya-oxuya başlarına, sinələrinə vurub şivən qoparma mərasimi (sözün əsli "Şah, Hüseyn! Vah, Hüseyn!"-dir). *Səhnənin dalından təbil və sinc səsi gəlir. Şaxsey-vaxsey sədası eşidilir.* Ə.Haqverdiyev.

**ŞAX-ŞAX: şax-şax baxmaq** – təşəxxüslə, qürurla, cəsarətlə baxmaq. [Məsmə] *üzünü Şərəbanı arvada tutub şax-şax baxdı.* Mir Cəlal.

**ŞAXŞAX** *is.* Silkələdikdə içərisindəki xırda daşlardan səs çıxan uşaq oyuncağı. *Uşaq üçün şaxşax almaq.* – [Oyuncaqsatan:] *Ay yaxşı şaxşax, banlayan xoruz!* M.S.Ordubadi.

**ŞAX-ŞƏVƏL** *top.* Şax, ağac qırıntıları, kolkos. *Yolun kənarlarını şax-şəvəl basmışdı.* – *Kəlbalanı yolun qırağında şax-şəvəlin içərisində zarıyan bir halda tapmış və götürmüşdülər.* S.Rəhimov. *Tutu dinləyib gözünü Qönçədən çəkdi, dərədəki şax-şəvələ baxdı.* Ə.Vəliyev. *..Suyun bir hissəsini arxa döndərmək üçün adamlar məftillə sarınmış şax-şəvəldən hər birisi iki yük maşını boyda "qomlar" düzəldib çaya salırdılar.* İ.Əfəndiyev.

**ŞAXTA[1]** *is.* Çox soyuq, qış havası, bərk soyuq, sıfırdan aşağı hava temperaturu. *Qar basmış küçələrdə şiddətli xəzri vıyıldayırdı. Şaxta insanın nəfəsini belə dondururdu.* M.Hüseyn. *Şiddətli yanvar şaxtası kəsib tökürdü.* Mir Cəlal.

**ŞÁXTA[2]** [*alm.*] 1. Faydalı qazıntıların çıxarıldığı və yeraltı işlərin aparıldığı yer. *Don hövzəsi şaxtaları. Metro tikintisi şaxtası.*

2. *tex.* Bəzi konstruksiyalarda uzun, vertikal boşluq.

**ŞAXTAÇI** *is.* Şaxtada işləyən fəhlə, mədən fəhləsi. *Şaxtaçı günü. Metro inşaatı şaxtaçıları.* – *Şaxtaçılar çalarkən zərbəsini dağlara; Radiodan yayıldı bu səda uzaqlara.* M.Rahim. *Yarışır hər şaxtaçı, metalçı, neftçi fəhlə.* Ə.Cəmil.

**ŞAXTALI** *sif.* Bərk soyuq. *Şaxtalı günlər. Şaxtalı gecə.* – *Dərəcəsi, ölçüsü; Mənim vaxt ölçüm oldu; Bir şaxtalı qışdayam; Mənə əlvan baharı; Unutduran sən oldun.* B.Vahabzadə. *Cahandar ağa .. nə qədər çalışdısa da, əllərinin, çənəsinin əsməsini dayandıra bilmədi. Sanki onu şaxtalı, boranlı qış günündə buzlu suya saldılar.* İ.Şıxlı.

**ŞAXTYOR** b a x **şaxtaçı**.

**ŞAİQ** [*ər.*] *klas.* Bir şeyə böyük şövqü, həvəsi, meyli olan; şövqlü. [Molla İbrahimxəlil:] *Mən də sizi görməyə çox şad idim.* M.F.Axundzadə. *Yaran, bahar mövsümüdür aşiq olmalı; Canan yolunda ölmək üçün şair olmalı.* A.Səhhət.

**ŞAİR** *is.* [*ər.*] Şeir söyləyən və ya yazan şəxs; təbiətində şeir söyləmək və yazmaq qabiliyyəti olan şəxs. *Sabir Azərbaycanın böyük satirik şairidir.* – *Bizdə şeir də var, sənət də vardır. Şairə, sənətə hörmət də vardır.* S.Vurğun. *Aləmə vəlvələ salmaq lazım; Quruluş şairi olmaq lazım.* M.Müşfiq.

**ŞAİRANƏ** *sif.* və *zərf* [*ər.* şair və *fars.* ...anə] 1. Şairə xas, şair kimi, şairə məxsus; bədii. *Xosrov yeddiillik məktəb qurtarmış, şeirlər yazmış və şairanə duyğularla yaşayan bir gənc olmuşdu.* S.Rəhimov.

2. *məc.* Gözəl, qəşəng, füsunkar, məftunedici, valehedici. [Şeyx Sənan:] *Nə qədər şairanə bir xilqət! Yerə enmişdir adətən cənnət!* H.Cavid. *Şairanə bir gecədir Kür qırağında; Ağ ulduzlar çiçək-çiçək, göy üzü çəmən.* S.Vurğun.

**ŞAİRƏ** *is.* [*ər.*] Qadın şair. *Cəfərin bibisi şairə idi.* M.Arif. *Səsimizi eşitdi; Tez gəldi şairə də; Görəndə səni birdən; Yerində dondu qaldı.* R.Rza.

**ŞAİRKÖNÜLLÜ** *sif.* Şair xasiyyətli, şair təbiətli, həssasqəlbli, incəqəlbli. *Şairkönüllü adam. – Gecə açılmayır, doğmayır sabah; O şairkönüllü, xoşxəyallıya.* S.Vurğun.

**ŞAİRLİK** *is.* Şeir yazma, şeir qoşma sənəti. *Cəfər* [Abdulla Şaiqin] *hər bir addımını, hərəkətini təqib edir, elə bil, ondan şairlik ilhamı almağa çalışırdı.* M.Arif.

**ŞAKƏR** *is.* [*ər.*] Xasiyyət, adət, vərdiş, əda. *Bildirçinin bir qəribə şakəri vardır ki, yeri gen olsa oxumaz.* H.Sarabski. *Əhli-eşqə bu qədər naz eləmək yaxşı deyil; Bəsdir, insaf elə, əl çək bu yaman şakərdən!* Ə.Vahid.

**ŞAQHAŞAQ** *zərf* Şarıltı ilə, gurultu ilə, gur səslə. *Sel şaqhaşaq üzüaşağı tökülürdü. – Guruldadı göy şaqhaşaq; İldırımlar şığıyaraq; Qaranlıqda tez-tez çaxdı.* M.Dilbazi.

**ŞAQIRDAMAQ** bax **şaqqıldamaq** 5-ci mənada. *Ağzında min bir dastan; Bülbül kimi şaqırdar.* A.Şaiq.

**ŞAQIRTI** bax **şaqqıltı**. *İri qanad şaqırtısına bənzər bir səs hələ alaçığımızın üstündə eşidilirdi.* A.Şaiq.

**ŞAQ(Q)** *təql.* Atılan güllədən və ya sınan ağacdan, budaqdan çıxan səs. *Şaqq güllə səsi eşidildi. Şaqq ağac sındı. – Bu səslə tapança da dilləndi. Şaq, şaq güllələr açıldı.* Mir Cəlal.

**ŞAQQA** *is.* İkiyə parçalanmış cəmdək. [Fərhad:] *Bir qoyunun da şaqqasını yemək olarmı?* Ə.Haqverdiyev. *Tahirzadənin ilk işi o oldu ki, şərikli kəsdikləri şişəyin bütöv bir şaqqasını ayırıb, südçü məhəlləsinə, Məsmənin evinə göndərdi.* Mir Cəlal.

**ŞAQQA(NAQ): şaqqa(naq) çəkmək, şaqqa(naq) çəkib gülmək** – bərkdən gülmək, qəhqəhə ilə gülmək, şaqqıltı ilə gülmək. *Dəli Həsən bir Koroğluya baxdı, bir dönüb başının adamlarına baxdı, hündürdən bir şaqqa çəkib güldü.* "Koroğlu". *...Xan şaqqa çəkib güldü.* S.Rəhimov.

**ŞAQQALAMA** "Şaqqalamaq"dan *f.is.*

**ŞAQQALAMAQ** *f.* Şaqqa halında bölmək, parçalamaq; iki parçaya ayırmaq. [Qulu] *..qəssab kimi qızğın halda inəyi şaqqalayırdı.* M.İbrahimov. *Məmməd kişi həyətdə təzəcə kəsdiyi qoyunu şaqqalayırdı.* S.Rəhman. *Sonra Soltan xəncərini siyirib, ayını şaqqaladı.* İ.Əfəndiyev. // Məc. mənada. [Fatma xanım:] *Xiyar əyri bitəndə, a qız, analı-qızlı məni şaqqalayacaqsınız.* N.Vəzirov.

**ŞAQQALANMA** "Şaqqalanmaq"dan *f.is.*

**ŞAQQALANMAQ** *f.* 1. Uzununa iki tən hissəyə bölünmək.

2. İki yerə ayrılma, haçalanmaq. *Dağ iki yana şaqqalanmışdı. – İki yana şaqqalanmış* (f.sif.) .. *Tərtər çayının oynaq səsi .. dağlara çal-çağır salırdı.* S.Rəhimov.

**ŞAQQALATMA** "Şaqqalatmaq"dan *f.is.*

**ŞAQQALATMAQ** *icb.* Uzununa iki hissəyə parçalatmaq, tən yarıya böldürmək. *Qoyunu şaqqalatmaq.*

**ŞAQQALI** *sif.* Enlikürək, gövdəli, iri. *Məmmədyarov kök, şaqqalı, qapqara saqqalı, bığı olan bir adamdı.* S.Rəhman. [Ağasəfər] *.. şaqqalı cavan oğlana baxdı və qrammofonun susduğundan yalnız indi xəbər tutmuş kimi təəccüblə soruşdu.* Ə.Əbülhəsən.

**ŞAQQAŞAQ** *təql.* Ağac və s. kövrək şeylərin sınmasından və ya bir-birinə toxunmasından hasil olan səs. // *zərf Şaqqıltı ilə.* [Oğlan] *daş-qaşı bir-bir ehtiyatla götürüb yanından sallanan qiymət kağızını nəzərdən keçirdi, sayğacdakı dənələri şaqqaşaq tərpətdi.* S.Rəhimov. *Küçədə adam artırdı. Kitabsatan vəziyyəti belə gördü, tez qıfılı əlinə aldı, qapılarını şaqqaşaq çəkib bağladı.* Mir Cəlal.

**ŞAQQILDAQ** *is.* 1. Şaqqıltı səsi çıxaran uşaq oyuncağı; şaxşax. // Probka gülləatan uşaq tapançası.

2. Ritmik səs yaratmaq üçün zərbli musiqi aləti.

**ŞAQQILDAMA** "Şaqqıldamaq"dan *f.is.*

**ŞAQQILDAMAQ** *f.* 1. Şaqqıltı səsi çıxarmaq. *Dağların başında gurultu güclənir, ildırım şaqqıldayır, yeri-yurdu tərpədirdi.* S.Rəhimov. *Göy gurultusu .. qulaqbatıran bir dəhşətlə şaqqıldayırdı.* M.Hüseyn.

2. Çatırdamaq, çırtıldamaq, şaq-şaq səs çıxarmaq. *Sübhün həzin küləyi yaşıl yarpaqları bir-birinə vurub şaqqıldadırdı.* Çəmənzəminli. *Kəhrəbadan seçilməz alxımlar nəzərində; Ağzında şaqqıldayıb hər giləsi bal dadar.* S.Rüstəm. *Üzüm nə üzüm! Şəkər kimi şaqqıldayır, diş vuran kimi qana keçir.* Mir Cəlal.

3. Tərpəndikcə, bir-birinə dəydikcə şaqqıltı səsi çıxar(t)maq (bədən sümükləri haqqında). [Dərviş:] *Canımda bir uçunma peyda oldu, dişlərim şaqqıldamağa az qaldı, canıma yanğı düşdü.* A.Divanbəyoğlu. [İlyas:] *Tərlanın boynu şaqqıldadı. O, yanakı sıçrayıb sıldırım qırağıyla çaparaq, enişə doğru getdi.* Ə.Məmmədxanlı.

4. Şaqqanaq çəkib gülmək, qəhqəhə ilə gülmək. *Məşədibəy şaqqıldayıb güldü və yumurtanı əlinə aldı.* M.Hüseyn. *Nəriman əmi .. əllərini bir-birinə vuraraq bərkdən şaqqıldadı.* İ.Əfəndiyev.

5. Cəh-cəh vurmaq, cəh-cəhlə ötmək, oxumaq. *Meyvəlidir ormanında ağaclar; Şaqqıldayır qırqovullar, turaclar.* A.Səhhət.

**ŞAQQILDAŞMA** "Şaqqıldaşmaq"dan *f.is.*

**ŞAQQILDAŞMAQ** *qarş.* 1. Şaqqıldamaq, şaq-şaq səs çıxarmaq (çox şey haqqında). *Bir tərəfdə çeşmələr şaqqıldaşırdı. Bir tərəfdə gözəl çiçəklər qoxuyurdu. Mərmər hovuzlarda qızıl balıqlar oynaşırdı.* Çəmənzəminli.

2. Qəhqəhə çəkib gülmək (çoxları haqqında). *..Traktoristlər artıq özlərini saxlaya bilməyib, şaqqıldaşıb gülüşdülər.* Ə.Məmmədxanlı.

**ŞAQQILDATMA** "Şaqqıldatmaq"dan *f.is.*

**ŞAQQILDATMAQ** *icb.* Bir şeyi digərinə vuraraq, toxunduraraq, çırparaq şaqqıltı səsi çıxartmaq. *Sayğacın daşlarını şaqqıldatmaq. Qamçını şaqqıldatmaq. – Əmirqulu muşquraraq şallağını havada şaqqıldatdı.* M.Hüseyn.

**ŞAQQILTI** *is.* 1. Sınan, partlayan, bir-birinə dəyən şeylərdən, habelə ildırım çaxmasından, tez-tez atılan güllədən çıxan bərk qırıq səs. *Birdən dışarıda şaqqıltı gəldi, sonra otağın qapıları açıldı, içəri bir kişi itələyib saldılar.* Çəmənzəminli. *..Göyün dağlara səda salan şaqqıltısı .. bütün kişiləri də qorxuya salır.* S.S.Axundov. *Pulemyotların şaqqıltısından qulaq tutulurdu.* Ə.Vəliyev.

2. Bərkdən gülüş səsi, qəhqəhə səsi. *Elə ki ikimiz olardıq, bir demək, bir danışmaq, bir qaqqıltı, bir şaqqıltı.* Mir Cəlal.

**ŞAQQIMA** "Şaqqımaq"dan *f.is.*

**ŞAQQIMAQ** b a x **şaqqıldamaq**. *Göydə nə ay, nə ulduz, bütün dünya qapqara; İldırımlar şaqqıyır tərpənməyən dağlara.* S.Vurğun.

**ŞAQRAQ**[1] *sif.* Şən, nəşəli, sevincgətirən, fərəhgətirən, ürəkaçan. *Gözəldir baharın ilıq nəfəsi; Gözəldir bülbülün şaqraq nəğməsi.* A.Şaiq. *Şəhər tərəfdən qopan şən və şaqraq səslər şüalar kimi aləmə yayıldı.* Mir Cəlal. *Uşaqlar içində bir qız da vardı; Könlümü oxşardı şaqraq səsiylə.* B.Vahabzadə.

**ŞAQRAQ**[2] b a x **qarquşu**.

**ŞAQREN** *is.* [*fr.*] Yumşaq meşin dəri; qoduq dərisi.

**ŞAQ-ŞAQ** *zərf* Qəhqəhə ilə, şaqqanaq çəkərək. *Şaq-şaq gülmək.*

**ŞAQŞARAQ** b a x **şaqhaşaq**. *Artıq "şaqşaraq" gurultu gəlir, sanki Dəlidağ aşağı ağarıb axan, köpüklənən nəhəng bir çayın ağzı açılırdı.* S.Rəhimov.

**ŞAQUL** *is.* [*ər.*] Divarın şaquliliyini, düzlüyünü yoxlamaq üçün ucuna kiçik ağırlıq bağlanmış qaytan və ya ipdən ibarət alət; şüyül.

**ŞAQULİ** *sif.* [*ər.*] Şaqul kimi yuxarıdan aşağıya enən; şaqul vəziyyətində olan; vertikal. *Şaquli xətt. – Bu zaman məzarın başı ucunda qoyulmuş top kimi yuvarlaq və şaquli şəkilli bir çox təbii daşlar gördüm.* A.Şaiq. [Səməd] *yoldaşlarına üz tutub, borulardan birini şaquli vəziyyətdə suya salmağı xahiş eləyir.* M.Hüseyn.

**ŞAL** *is.* 1. Yundan və s.-dən toxunmuş böyük baş örtüyü. *İpək saçaqlı şal. Tirmə şal. – Köçən qızı şal, yaxud çarşaba bürüyüb, o yığıncağın bir səmtində oturdardılar.* R.Əfəndiyev. *Sənəm dönüb, otaqdan yun şalını götürdü.* S.Rəhimov.

2. Nazik, yumşaq yun parça. [Kişinin] *əynində qara şaldan beli büzməli don vardı.* H.Sarabski. *Güllü arvad sumağı şaldan genbol qırmızı tuman, yaxası və qolunun ağzı baftalı uzun arxalıq geymişdi.* Ə.Əbülhəsən. // Şaldan tikilmiş. *Şal paltar. – ..*[Ərşadın] *əynində əldətoxunma yun şal pencək-şalvar .. gəldi.* İ.Əfəndiyev. **Kəşmiri şal** – vaxtilə Hindistanın Kəşmir vilayətindən gətirilən zərif, yumşaq və spesifik naxışlı yun parça, şal.

**ŞALAXO** *is.* [*gürc.*] İti oynanılan şən oyun havası.

**ŞALAQ** *is. məh.* 1. İri, sarı yemiş. *Məlumdur ki, bir az hava qızdı, tərəkəmə əhli aranda*

*dayana bilməz. Gərəkdir yaylağa qaçsın və orada soyuq düşənə kimi gərək bağ-bostan solmamış özünü arana yetirib, şalaqdan və kal meyvədən yeyib qızdırmaya düşsün*. F.Köçərli. ☐ **Şalaq qovun (yemiş)** – tezyetişən iri qovun növü.

2. Kələmin kökünün dibində olan iri, qalın yarpaq.

3. *məc. dan.* Abırsız, həyasız. *O, şalağın biridir*.

**ŞALAPÁY** [*rus.*] Avara, veyil. *Amma xalaoğlum Əhməd şalapay çıxdı və özünü binamazlara yavıq saxladı.* C.Məmmədquluzadə.

**ŞALBAN** *is.* Şaxı, budağı, üst qatı təmizlənmiş böyük ağacın gövdəsi; dirək. *Şalbanın bir ucu sənin çiynindədir.* (Ata. sözü). [Mətbəxlərdə] *şalbanlardan asılan, qışdan qalmış balqabaq, kudu, soğan, quru balıq, dəstə ilə qurumuş qarğıdalı, narın süpürgə, bezdən qab dəsmalları nəzərə çarpırdı.* H.Sarabski.

**ŞALĞAM** *is.* Xörəyə qatılan və ya heyvan yemi kimi işlədilən kökü yumru və ya uzun bostan bitkisi. *Şalğam şorbasında turp özünü yağ sanar*. (Məsəl).

◊ **Şalğam etmək (eləmək)** – darmadağın eləmək, qılıncdan keçirmək. [Dəlilər] *Xəlil paşanın qoşununu hər tərəfdən şalğam eləyib, arakəsməyə salıb təklədilər.* "Koroğlu".

**ŞALĞAMLIQ** *is.* Şalğam əkilmiş yer, şalğam bostanı.

**ŞALLAQ** b a x **qırma(n)c**. *Küçədən fərraş Şimirəli əlində şallaq daxil olur.* C.Məmmədquluzadə. *Əmirqulu muşquraraq, şallağını havada şaqqıldatdı.* M.Hüseyn. ☐ **Şallağa tutmaq** – b a x **şallaqlamaq**. *Sən hey de yoxumdur, çıxarıb canını allam! Vallah, oyub dideyi-giryanını allam! Şallağa tutub peysəri-üryanını allam!* M.Ə.Sabir.

**ŞALLAQLAMA** "Şallaqlamaq"dan *f.is.*

**ŞALLAQLAMAQ** *f.* Şallaqla vurmaq, qamçılamaq, qırmanclamaq. *Atı şallaqlamaq.* – *Sanki Əsgər yuxuda idi, indi ayıldı, kəlləri şallaqlamağa başladı.* Ə.Vəliyev. // Məc. mənada. [Mustafa həkimə:] *Axı bu dəlini gətirib buraya qatmısınız, bizim günahımız nədi, bizi şallaqlayır?* C.Məmmədquluzadə.

**ŞALLAQLANMA** "Şallaqlanmaq"dan *f.is.*

**ŞALLAQLANMAQ** *məch.* Şallaqla döyülmək, qırmanclanmaq, qamçılanmaq.

**ŞALLI** *sif.* Başına şal örtmüş, yaxud belinə şal bağlamış.

**ŞALVAR** *is.* Bədənin beldən aşağı hissəsini və qıçları örtən ikibalaqlı üst kişi geyimi. *Şərəfoğlu .. şalvarının cibindən balaca bir açar çıxarıb, stolun siyirməsini açdı və oradan böyük bir kağız vərəqi götürdü.* M.İbrahimov. *Muxtar Zeynalov .. əllərini şalvar cibinə salıb, kabinetində gəzinməyə, dodaqaltı deyinməyə başladı.* Ə.Vəliyev.

**ŞALVARLIQ** *sif.* Şalvara yarar. *Yaxşı şalvarlıq parçadır.* – [Bəy xonçasında] *dolaqlar, bir şalvarlıq mahud və bunların əmsalı cehizlər qoyulmuş olur*. R.Əfəndiyev. // İs. mənasında. *Mağazadan şalvarlıq almaq*.

**ŞAM[1]** *is.* [*ər.*] İçinə fitil qoyulmuş piyli maddələrdən hazırlanan silindrik işıq ləvazimi. *Yanır qəribanə kənd axşamları; Titrək işıqlarla məscid şamları.* S.Vurğun. *Çapıq Abbas cibindən uzun bir şam çıxarıb ortaya qoydu*. S.Rəhman. // Lampa və s. işıq cihazları mənasında. *Axşam oldu, gün batdı, şamlar yandı*. A.Səhhət.

◊ **Şam kimi (təki) sönmək** – puça çıxmaq, yox olmaq. *Orada ağladıqca hər dustaq ürək; Şam təki sönmüşdür ümidlə dilək.* S.Vurğun. **Şam kimi ərimək, şama dönüb ərimək** – gündən-günə ərimək, çox arıqlamaq, ətini tökmək. *Mələk şam kimi ərisə də, dərdini heç kəsə açmırdı.* İ.Şıxlı. *Zeynalın verdiyi şəklə baxandan sonra Mülayim arvad ikicə günün içində şam kimi ərimişdi*. B.Bayramov. **Burnuna şam iyi dəyməyib** – bərkdən-boşdan çıxmamış, dərd görməmiş adam haqqında.

**ŞAM[2]** *is.* [*fars.*] 1. Axşam. *Şam süfrəsi.* ☐ **Şam(ü) səhər** – axşam-səhər, səhər-axşam. *Şamü səhər bülbül kimi ağlaram; Qorxuram qönçədən gülüm pozula.* Aşıq Murad. *Gəl, baba, məscidlərə, ehsanı gör! Şamü səhər aşı, fisincanı gör!* Ə.Nəzmi. **Şam ta səhər** *klas.* – axşamdan-səhərədək. *Dolanım başına şam ta səhər; Şəmi-camalının pərvanəsiyəm.* Q.Zakir.

2. Axşam yeməyi. *..Yusif şah buyurdu: – Tapşır, mənə şam hazır etsinlər ki, bu gün bir zad yeməmişəm*. M.F.Axundzadə. *Şamdan sonra xan yenə özünü çırthaçırtla yanan buxarının yanına verib oturdu*. Çəmənzəminli. *Hamı yedi, şam bitdi. Amma Məstan bəyin gözü yolda qaldı.* B.Talıblı. ☐ **Şam et-**

**mək (eləmək)** – axşam yeməyi yemək. *Saat on birdə yenə qonaqları dəvət elədilər xörək otağına və yenə ağalar və xanımlar xörək stolunun ətrafına düzülüb başladılar şam eləməyə.* C.Məmmədquluzadə.

**ŞAM**[3], **ŞAMAĞACI** *is. bot.* İynəyarpaqlı, həmişəyaşıl, xırda qozaları olan ağac. [Şəmsiyyə və Səlimi] *həyətə çıxdılar, cərgə ilə düzülmüş şamağaclarının arasında gəzməyə başladılar.* M.İbrahimov. *Şıdırğı yaz yağışından sonra qarağac, qələmə, şamağacları sükuta qərq olmuşdu.* Mir Cəlal.

**ŞAMAMA** *is.* [*ər.*] Çox ətirli və şirin, adətən yeyilməyən kiçik yemiş növü. *Mən gələndə şamamalar gülüdü; Dörd yanımı atlı kazaq bürüdü.* "Qaçaq Nəbi". *Cavanlar özləri ilə toyxanaya alma, portağal, şamama, .. püstə, badam gətirərdilər.* H.Sarabski. *Xarabalar əvəzinə qovunlar, şamamalar rəng verib rəng alırdı.* M.Hüseyn. ☐ **Şamama kimi** – 1) çəhrayı, təzə, tər. *Qumrunun şamama kimi tər, mərmər kimi ağ vücudunu gördükdə atlı içindən qovrulur*(*du*). Mir Cəlal; 2) yumru, girdə.

**ŞAMÁN** *is.* [*tunq.*] Ruhlara, magiyaya inanan xalqlarda (əsasən şimal xalqlarında): sehrbaz, ovsunçu, cadugər (şamanlar oxumaqla, dəf çalıb-oynamaqla özlərini cuşa gətirərək, guya ruhlarla münasibətə girərək, adamların xəstəliklərini sağaltdıqlarına, onlara uğurlu ov təmin etdiklərinə və s.-yə inanırdılar).

**ŞAMANİZM** bax **şamanlıq**.

**ŞAMANLIQ** *is.* 1. Bəzi şimal, Orta Asiya, İndoneziya, Okeaniya, Amerika, Afrika xalqlarında ruhlara, magiyaya sitayiş etməkdən ibarət din forması.

2. Şamanın işi, peşəsi; sehrbazlıq, cadugərlik.

**ŞAMATA** bax **şəmatət**.

**ŞAMAYI** *is.* [*fars.*] Xəzər, Qara dəniz, Azov dənizləri hövzələrində çox yayılmış balıq. *Şamayı .. pulcuqları gümüşü, bel tərəfi tünd-yaşıl, üzgəcləri isə açıq rəngdə olur.* Y.Əbdürrəhmanov.

**ŞAMDAN** *is.* [*ər.* və *fars.*] Şam qoymaq üçün altlıq. *Otaqlarda yanan şamdanlar söndürülmüşdü.* M.S.Ordubadi. *Pəncərədən sarı şamdanlar asılardı.* H.Sarabski.

**ŞAMDANÇI** *is.* Keçmişdə: saraylarda işıq işlərinə baxan şəxs.

**ŞAMDANGÜLÜ** *is. bot.* Ətirşah fəsiləsindən bəzək bitkisi. *Ətirşah fəsiləsinin şamdangülü cinsinin növləri bəzək bitkiləridir.* M.Qasımov.

**ŞAMİL** *is.* [*ər.*] İçinə alma, qaplama, aid olma, dəxli olma (adətən "etmək", "olmaq" köməkçi feillərilə işlənir). *Bu məsələ sizə də şamildir. Göstəriş hamıya şamildir.* ☐ **Şamil etmək** – aid etmək. [Nuxulular:] *Saniyən, hər birimiz bir töhfeyi-həqir xidmətinə gətirmişik, əgər qəbul edib öz şəfqətini bizə şamil edə.* M.F.Axundzadə. *Xəlifə onların hər birisinə tək-tək cavab verib, onlar üçün Allah dərgahından səadət və dövlət rica edəcəyini və duasını onların barəsində şamil edəcəyini vədə verdi.* M.S.Ordubadi.

**ŞAMKİMİLƏR** *cəm bot.* Çılpaq-toxumlu, iynəyarpaqlı bitkilər fəsiləsinin adı. *Şamkimilər fəsiləsinin .. yarpaqları xırda pulcuq şəkilli və ya dəstələrlə yığılmış iynəşəkillidir. Toxumdaşıyan qozaları nisbətən kiçik olub girdədir, toxumları yetişəndə ağaclaşır və ya giləmeyvə şəklini alır.* H.Qədirov.

**ŞAMLIQ**[1] *is.* Axşam yeməyi, axşam üçün hazırlanan yemək(lər). *Şamlıq nəyiniz var? Şamlıq hazırlamaq.*

**ŞAMLIQ**[2] *is.* Çoxlu şam ağacı bitən yer, şam meşəsi. *Kəndin üst tərəfi şamlıqdır. – Doktor otağına qayıtdı. Şamlığa açılan pəncərələri geniş-geniş açdı.* A.Şaiq.

**ŞAMÓT** *is.* [*fr.*] Odadavamlı bişmiş gil və həmin gildən hazırlanmış kərpic.

**ŞAMPÁN** [coğrafi addan] Köpüklənən, qazlı üzüm şərabı. *Azərbaycan Şampan şərabı.*

**ŞAMPÁNSKİ** [*rus.* "шампанское"dən] *dan.* bax **şampan**. [Səfdərqulu bəy:] *Mənim sağlığıma bir stəkan şampanski içməyə də vaxtın yoxdur.* S.S.Axundov. [Əsgər:] *Elə belə, komandirsən, gəl gedək, bizim komanda məntəqəsinə bax: lampası... peçi... çayı, şampanskisi...* Ə.Əbülhəsən.

**ŞAMPÚN** [*ing.*] Baş yumaq üçün ətirli duru sabun və ya sabun tozu.

**ŞAMSIZ** *zərf* Axşam yeməyi yemədən. *Qonşuya ümid olan şamsız yatar*. (Ata. sözü). *Çox gecəm var ki*, *şamsız yatıram; Çaysız,*

*həm təamsız yatıram.* S.Ə.Şirvani. [Pəricahan xanım:] [Ağca xanımı] *otağına aparın. Bu gecə şamsız qalacaqdır.* S.S.Axundov.

**ŞAN**[1] *is.* [*ər.*] Ad-san, şöhrət, şərəf. *Bürüyüb aləmi şanın, şöhrətin; Bir de, qoç Koroğlu, nədən məlulsan?* "Koroğlu". [Cəngavər:] *Səyavuş bu yurdun fəxri, şanıdır.* H.Cavid.

**ŞAN**[2] *is.* Balı saxlamaq və toxum tökmək üçün arıların pətəkdə mumdan düzəltdikləri gözcüklər. *Bu təsəlli mənə bəsdir, olar asudə halım; Ki, bu şanlarda mənim də var iki qətrə balım.* A.Səhhət. *Kosa əlindəki suyu süzülən şanları pəncərəyə qoyub çıxa-çıxa deyindi..* S.Rəhimov.

**ŞANA** *is.* Otu, samanı, küləşi yığmaq üçün uzunsaplaqlı diş-diş dəmir və ya ağac alət, yaba. *Qəhrəman .. xırmandan kənara çıxmır və şananı yerə salmırdı.* S.Rəhimov. [Musa:] *Oğlan, şananı mənə ver..* M.İbrahimov.

**ŞANAGÜLLƏ** *is. bot.* Sulaqlı yerlərdə bitən çiçəkli su bitkisi..

**ŞANALAMA** "Şanalamaq"dan *f.is.*

**ŞANALAMAQ** *f.* Şana ilə otu, küləşi, samanı və s.-ni yığmaq, yaymaq, atmaq, səpələmək. *Həsi bu gün böyük xırmanın qırağını əvvəlcə çaldı, sonra şanaladı.* S.Rəhimov.

**ŞANAPİPİK** *is. zool.* Əyri dimdiyi, darağabənzər kəkili, ala-bəzək lələyi olan quş; şinəbub.

**ŞANA-ŞANA** *sif.* Göz-göz, dəlik-dəlik.

**ŞAN-BEÇƏ** *is.* Cavan bal arısı. *Şan-beçə balı. – Yetər bu dəfə böyük və ağ süfrə ilə örtülü bir məcməyi gətirib ortalığa qoydu,* ..[məcməyidə] *sapsarı təzə nehrədən çıxmış inək yağı, bir yekə nimçə şan-beçə balı, bir böyük kasa camış qatığı, altı yumurtanın qayğanağı* (*vardı*). Qantəmir.

**ŞANƏ** *is.* [*fars.*] *klas.* Daraq. *Xumar-xumar baxmaq göz qaydasıdır; Lalətək qızarmaq üz qaydasıdır; Pərişanlıq zülfün öz qaydasıdır; Nə badi-səbadan, nə şanədəndir.* M.P.Vaqif.

**ŞANƏLƏNMƏ** "Şanələnmək"dən *f.is.*

**ŞANƏLƏNMƏK** *f. klas.* Şanə-şanə olmaq. // *məc.* Dəlik-dəlik, deşik-deşik olmaq, parçalanmaq. *Qəmzə xəncərindən, müjgan oxundan; Ciyər parə-parə, dil şanələnmiş.* M.V.Vidadi.

**ŞANƏ-ŞANƏ** *zərf klas.* Parça-parça, tikə-tikə, deşik-deşik. ☐ **Şanə-şanə olmaq** *klas.* – parça-parça olmaq, tikə-tikə olmaq, dəlik-dəlik olmaq, şanələnmək.

**ŞANI** *is.* Çox şirin, şirəli, ətirli üzüm növü. *Ağ şanı. Qara şanı.* – [Səkinə qarı:] *Qarpız da almışam, hələ Buzovnadan şanı da gətiriblər.* M.İbrahimov.

**ŞANLI** *sif.* 1. Rəşadətli, cəsur, qəhrəman. *Şanlı əsgərlərimiz.* // Şöhrətli, şərəfli, uca. – [Nüşabə:] *Şanlı tariximiz görməmiş ləkə; Zəfərlər qazanmış bu şanlı ölkə!* A.Şaiq. *Bu günlər, şanlı günlər, şən günlər; Yoluna düşən günlər; Hələ qarşımızdadır.* M.Müşfiq.

2. Möhtəşəm, əzəmətli. *Şanlı saray.*

**ŞANLI-ŞƏRAFƏTLİ (ŞÖHRƏTLİ)** bax **şanlı-şövkətli (şöhrətli)**.

**ŞANLI-ŞÖVKƏTLİ (ŞÖHRƏTLİ)** *sif.* Yüksək şanlı, şərəfli, yüksək mənsəbli. // Dəbdəbəli, həşəmətli, cah-calallı.

**ŞANS** *is.* [*fr.*] Uğur qazanmaq imkanı.

**ŞANSÓN** *is.* [*fr.*] XV-XVI əsrlərdə fransız musiqi renessansının (intibahının) görkəmli nümayəndələrinin yaradıcılığında aydın milli xüsusiyyətlər kəsb edən polifonik mahnılar.

**ŞAN-ŞAN** *sif.* Şanlar şəklində, göz-göz, deşik-deşik. *..Sinənin içində olan ağ ciyər şan-şandır.* H.Zərdabi. ☐ **Şan-şan etmək (eləmək)** – deşik-deşik etmək. *Güllə sinəsini şan-şan elədi. – Hamı adamların gözünün qabağında Nəbigil Məcid bəyi güllələyib şan-şan elədilər.* "Qaçaq Nəbi". *Vurub bağrını* [tərlanın] *elədi şan-şan.* M.Seyidzadə. **Şan-şan olmaq** – bax **şanə-şanə olmaq** ("**şanə-şanə**"də). *Çöldə taxıl şan-şan olur, tellənir; Dərya kimi ləpələnir, yellənir.* A.Səhhət.

◊ **Bağrı (ürəyi) şan-şan olmaq** – bax **bağrı qan olmaq** ("**bağır**"da). *Fələk saldı dürlü-dürlü odlara; Şan-şan olmuş, parələnmiş könlümü.* M.V.Vidadi. *Qara bağrım şan-şan oldu, dəlindi; Gahdan ağla, gahdan yada sal məni.* Aşıq Abbas. *Kimsənin Veysin şan-şan olan bağrından xəbəri yox idi.* Ə.Əbülhəsən. **Bağrını (ürəyini) şan-şan eləmək** – bax **bağrını qana döndərmək** ("**bağır**"da). *Aşiqlər bağrını şan-şan eylərsən; Gündə birin kəsib qurban eylərsən; Hər qıya baxanda yüz qan eylərsən; Müşküldür dolanmaq, yağı, səninlə.* Q.Zakir. *Çəkib almaz kirpiyini; Bağrımı şan-şan elədin.* Aşıq Ələsgər.

**ŞAN-ŞƏRAFƏT** bax **şan-şövkət (şöhrət)**.

**ŞAN-ŞÖVKƏT (ŞÖHRƏT)** *is.* Şöhrət, həşəmət, şan, ad-san. *Hanı nizəm, hanı atım? Kəsildi şanı-şövkətim...* "Koroğlu". *Tərk edərək bütün istirahəti; Qazanmışam mən bu şanü şövkəti.* A.Səhhət. *Qəhrəmandır, igidin hörməti var; Özü gənc olsa da şan-şöhrəti var.* A.Şaiq.

**ŞANTÁJ** *is.* [*fr.*] İfşaedici məlumat yayma hədəsi ilə nə isə tələb etməkdən ibarət cinayət.

**ŞANTAN** *is.* [*fr.*] Əyləncə müəssisəsi.

**ŞAPALAQ** *is.* 1. Əlin içi ilə vurulan zərbə, şillə. *Üzünə bir şapalaq çəkdi. – Məşədi Salman axırıncı dəfə bu cavabı eşitdikdə Məmmədə bir şapalaq vurdu.* T.Ş.Simurq. ..[Çobanların] *çomaqları ki əlindən düşdü kütləşdilər, yəni yumruqla, şapalaqla bir şey eləyə bilmirdilər.* İ.Əfəndiyev.

2. Ovuc, əliçi. *Qoca yemə cumdu, .. iki şapalaqda payının yarısını ötürdü.* M.Hüseyn. ☐ **Şapalaq vurmaq** – ovcu ilə, əlinin içilə götürmək, ovuclamaq. *Bəziləri, xüsusən kişilər sol əllərini yerə verib, sağ əli ilə aşa iri şapalaqlar vururdular.* Ə.Əbülhəsən.

◊ **Şapalaqla üz qızartmaq** – bir şeyi süni yolla gizlətməyə, yaxşı göstərməyə çalışmaq. [Hacı:] *Mən şapalaqla üz qızardıram, xaricilər elə bilirlər ki, Hacının qızılı daşır.* M.S.Ordubadi.

**ŞAPALAQLAMA** "Şapalaqlamaq"dan *f.is.*

**ŞAPALAQLAMAQ** *f.* Şapalaq vurmaq, şilləmək. [Müqim bəy] *sonra da ayaqlarının ucunda dikəlib, peysərini şapalaqladı.* S.Rəhimov. [Mollabacı] *..qulağımdan tutub, şapalaqlamağa başladı.* H.Sarabski. *Geysubəyim Manafı şapalaqlamağa, üzünə tüpürməyə, yenə də hərzə-hədyan danışmağa başladı.* Ə.Vəliyev.

**ŞAPALAQLANMA** "Şapalaqlanmaq"dan *f.is.*

**ŞAPALAQLANMAQ** *məch.* Şapalaqla vurulmaq, şapalaq yemək.

**ŞAPATLAMA** "Şapatlamaq"dan *f.is.*

**ŞAPATLAMAQ** *f.* Arasıkəsilmədən, dalbadal, şappaşap vurmaq. [Kəndli] *şəhərə bir azca ertə çatmaq üçün; Tələsirdi qabaqca satmaq üçün; Çün bu işdə qazanc adı var idi; Qazları incidib şapatlar idi.* A.Səhhət. [Hacı Qambay] *əlindəki qamçı ilə çatdığı uşağı şapatlayırdı.* Qantəmir.

**ŞAPIR-ŞAPIR** *zərf* Səs çıxara-çıxara, tez-tez; marçamarç. *Buzov şapır-şapır anasını əmirdi.* // Məc. mənada. *Bu səfahət və əyyaşlığın onlar bir gün cəzasını çəkəcəklər. Çəkincəyə qədər də həyatın bütün zövq və nəşəsini şapır-şapır əməcəklər.* A.Şaiq.

**ŞAPIRDATMA** "Şapırdatmaq"dan *f.is.*

**ŞAPIRDATMAQ** b a x **şappıldatmaq**. [Sadıq] *balın yarısını qayğanağa qarışdırandan sonra qatığın çox hissəsini də üstünə töküb, ağzını şapırdata-şapırdata yeyir.* Q.Qantəmir.

**ŞAPİRÓQRAF** [*xüs.* ad və *yun.* grapho – yazıram] Təkmilləşdirilmiş hektoqraf; əlyazmasını və ya çap ottisklərini çoxaltmaq üçün alət.

**ŞAPKÁ** [*rus.*] Əsasən isti, yumşaq baş geyimi, papaq. *Başına şapka qoymaq. – Kərbəlayı Zalın arvadı hərdənbir deyirdi: – A kişi, sənin saqqalına nə şaşka yaraşır, nə də şapka.* Ə.Haqverdiyev. [Musanın nəvəsinin] *başındakı xaki rəng şapkasını görüb, zənn etmə ki, daha onun başqa borcu yoxdur.* Qantəmir.

**ŞAPKAÇI** *is.* Şapka tikən usta. *Şapkaçı dükanı.*

**ŞAPKALI** *sif.* Başında şapka olan, şapka geymiş. *Bir gün* [çayçı dükanına] *qara şapkalı, çənəsində kiçik qarasaqqallı, qara paltarlı bir müsafir gəldi.* H.Nəzərli. *Məktəbin .. şapkalı tələbələri Hüseynin arıq və əsəbi üzünə yan-yanı baxır, onun cırıq paltarına, atasından qalma köhnə, iri ayaqqabılarına masqara edib gülürdülər.* S.Rəhman.

**ŞAPLAMA** "Şaplamaq"dan *f.is.*

**ŞAPLAMAQ** *f.* Şapalaq vurmaq, şapalaqlamaq. [Əhməd:] *İstəyirsənmi, peysərinə bir, beş, on yol da şaplayım, elə düz gedəsən?..* N.Vəzirov.

**ŞAPPADAN** *zərf* Birdən, qəfildən, gözlənilmədən. *Şappadan pəncərədən bir şey düşdü.*

**ŞAPPILDAMA** "Şappıldamaq"dan *f.is.*

**ŞAPPILDAMAQ** *f.* Şappıltı səsi çıxarmaq.

**ŞAPPILDATMA** "Şappıldatmaq"dan *f.is.*

**ŞAPPILDATMAQ** *icb.* Bir şeyi başqa bir şeyə vuraraq, çırparaq, toxunduraraq şappıltı səsi çıxartmaq. *Yenə də məsciddə heyrət başlandı, yenə də dilləri damaqlarda şappıldatmağa başladılar.* M.S.Ordubadi. ..[Nəzarətçilər] *qamçını .. bir-birinin qalın meşin çəkmələrinin boğazlarına çırpıb şappıldadır, bundan zövq alırdılar.* M.Rzaquluzadə.

**ŞAPPILTI** *is.* Bir şeyin başqa bir şeyə, yaxud bir-birinə dəyməsindən hasil olan səs. *Bir şappıltı eşidildi. – Cavab əvəzinə itlərdən birinə zərblə dəyən qırmancın şappıltısı eşidildi.* M.Hüseyn. *Bir də çayın içində şappıltı səsi eşidildi*. T.Ş.Simurq.

**ŞAP-ŞAP, ŞAP-ŞUP** *is.* Yüngül, dabanı açıq, yastı ayaqqabı. *Keçmiş zamanlarda .. hər arvadın ayağında şap-şapı və yastıdaban bir başmağı vardı.* Qantəmir.

**ŞAR** [*rus.*] 1. *riyaz.* Öz diametri ətrafında dairənin fırlanmasından yaranan həndəsi cisim; kürə. *Şarın radiusu. Şarın səthi.*

2. Bu şəkildə olan şey. *Bilyard şarı. Fənər şarı.*

3. *köhn.* Keçmişdə səsvermə zamanı istifadə edilən şarşəkilli şey (namizədin lehinə və əleyhinə verilən səsin miqdarı qutuya atılan şarın miqdarına əsasən təyin edilirdi). *Şarla səsəqoyma. Ağ şar* (*lehinə səs*). *Qara şar* (*əleyhinə səs*).

**ŞARABÁN** [*fr.*] 1. Keçmişdə bir neçə sıra uzununa oturacaqları olan dördçarxlı açıq minik arabası.

2. Biratlı, ikiçarxlı yüngül minik arabası. *Boş vaxtı axşam ki oldu, budur ha, faytonların, şarabanların başı açılırdı.* M.Rzaquluzadə.

**ŞARABƏNZƏR** *sif.* Şar kimi girdə, yumru, şaraoxşar, kürəşəkilli.

**ŞARADA** *is.* [*fr.*] Cavabı müxtəlif sözlərdən ibarət tapmaca. *İsti + ot = istiot.*

**ŞARAQQAŞARAQ** bax **şaqqaşaq**.

**ŞARAQQILTI** bax **şaqqıltı**. *Şamxal* [Çərkəzə] *çaxmaq şaqqıltısını eşidib dinləndi: – Ə, mənəm, nə səs-küy salıbsan?* İ.Şıxlı.

**ŞARAQ-ŞARAQ** *zərf* Şaraqqıltı ilə, şaraqqaşaraq. *Su şaraq-şaraq axaraq daşı, qumu bir-birinə qatıb gəlirdi.* M.İbrahimov. *Meşələr və uçurumlu dərə şaraq-şaraqla dolmuşdu.* İ.Əfəndiyev. *Darvazalar şaraq-şaraq; Gah örtüldü, gah açıldı.* B.Vahabzadə.

**ŞARAOXŞAR** bax **şarabənzər**.

**ŞARAP** *təql.* Ağır bir şeyin bütün ağırlığı ilə yerə dəyməsindən hasil olan səs. *Şarap, yük düşdü yerə.* – [Əsgər:] *Bir də gördüm, dalımca gələn götürüldü, ədə dayan, ədə dayan... Dayanmadı, part bir güllə. Bir də gördüm, şarap yıxıldı yerə.* Ü.Hacıbəyov.

**ŞARAPPADAN** bax **şappadan**. *Birdən Məmməd gördü ki, heyvanın gözləri yavaş-yavaş süzülüb yumuldu, qulaqları sallandı, durduğu halda yıxılıb, şarappadan yerə düşdü.* E.Sultanov.

**ŞARAPPAŞARAP** *təql. zərf mənasında.* Şappıltı ilə, şappıltı səsi çıxararaq. *Bir azdan yenə də həmin oynaq dalğalarda bir adam şarappaşarapla qayıtdı.* S.Rəhimov. *..Cənnət xanımın hirsi soyumadı, şarappaşarap ilə əl-üzünü yudu.* Mir Cəlal.

**ŞARF** bax **şərf**. *Müəllim göründü. Boynunu şarfla sarımışdı.* S.Hüseyn.

**ŞARHAŞAR** *zərf* Şiddətlə, şarıltı ilə (gur axan su haqqında). *Şarhaşar tökülmək. Navalça şarhaşar axırdı. – Tökdü birdən-birə yağış şarhaşar; Həyətdə, küçədə su daşdı, getdi.* R.Rza. *Bir azdan sonra yağış çiləməyə başladı və çox keçmədən şarhaşarla tökdü.* Ə.Sadıq.

**ŞARILDAMA** "Şarıldamaq"dan *f.is.*

**ŞARILDAMAQ** *f.* Şarıltı ilə axmaq, tökülmək və yaxud çarpmaq. *Dəniz yavaş-yavaş uğuldayır, dalğalar zərblə qayalara çırpılaraq şarıldayırdı.* M.Hüseyn.

**ŞARILTI** *is.* Gur axan sudan çıxan səs. [Xanlar] *..sahilə çırpınan dalğaların şarıltısını belə eşitməmişdi*. S.Rəhimov.

**ŞARIL-ŞARIL** *zərf* Şarıltı ilə, şır-şır. *Sular şarıl-şarıl axır.*

**ŞARJ** *is.* [*fr.*] Bir şəxsin və ya şeyin qəsdən gülünc, karikatura şəklində təsviri (söz və şəkillə).

**ŞARLATÁN** [*fr.*] Bir şey bilmədiyi halda, özünü bilən, mütəxəssis kimi göstərərək adamları aldadan, nadan; yalançı, fırıldaqçı, cüvəllağı. *Şarlatanın biridir. – Bunlar da yaxşı adamlardır, amma şarlatandırlar.* C.Məmmədquluzadə. // *zar.* Yüngül söyüş mənasında. [Məşədi İbad:] *Tuf!.. Rədd ol, şarlatan!..* Ü.Hacıbəyov. *Namuslu insanların içində; Orda-burda şarlatanlar da vardır.* R.Rza.

**ŞARLATANLIQ** *is.* Adamların məlumatsızlığından istifadə edərək onları həyasızcasına aldatma; kələkbazlıq, cüvəllağılıq. [Kərbəlayı Rəcəb:] *Zamanə cahılları şarlatanlıqdan başqa bir şeyə yaramazlar.* N.Vəzirov. *Hacı Saleh çox çalışdı ki, oğlunu oxutsun,*

*ancaq Əsgər şarlatanlıqdan əl çəkib oxumadı.* C.Cabbarlı. ◻ **Şarlatanlıq eləmək** – şarlatan kimi etmək, adamları aldatmaq.

**ŞARLI** *sif.* Şarı olan; öz quruluşunda, konstruksiyasında şaraoxşar hissələr olan. *Şarlı lampa. Şarlı fənər. – Birdən-birə enli, iki tərəfi xiyaban, baş küçədə cərgə-cərgə iri ağ şarlı işıqlar yandı.* M.Rzaquluzadə.

**ŞARNİR** *is.* [*alm.*] Mexanizmin hərəkətini təmin edən hissələrinin mühərrik birləşməsi.

**ŞARP, ŞARPADAN** *zərf* Gözlənilmədən, qəfildən, birdən. *Uşaq şarpadan üzüqoylu yıxıldı.* – [Dərviş:] *Ruqiyyə durub alaçığa qaçdı, orada şarpadan yıxıldı.* A.Divanbəyoğlu.

**ŞARPAŞARP** *zərf* Dalbadal, arasını kəsmədən, şiddətlə. *Şarpaşarp təpəsinə çırpmaq. Şarpaşarp kürəyinə vurmaq.* – [Odabaşı:] [Ana] *qızını bu halətdə görüb başladı şarpaşarp dizlərinə döyməyə.* Ə.Haqverdiyev. *Araba sürən cavan uşaqlar ayağa qalxıb, zoğal ağacı ilə şarpaşarp öküzləri döyəclədilər.* Mir Cəlal.

**ŞARPILDATMA** "Şarpıldatmaq"dan *f.is.*

**ŞARPILDATMAQ** *f.* Əl, qamçı və s. ilə dalbadal çırpmaq, vurmaq, şappıldatmaq. [Bəbir bəy] *gah fit çalır, gah da çəkməsinin boğazından asılan qamçını şappıldadaraq həzz alırdı.* Mir Cəlal.

**ŞARPILTI** b a x **şappıltı**.

**ŞAR-ŞAR(LA)** b a x **şarhaşar**. *..Tulumbarların taq-taqla qalxıb-düşməsi və qara neftin dağ çayları kimi şar-şar axıb çənlərə tökülməsi .. əhəng və əzəmət təşkil edirdi.* B.Talıblı.

**ŞARTAŞART** *təql.* Dalbadal açılan güllə, yaxud qamçı səsinə təqlidən deyilir. *Boyaboy bir-iki addım atıb, ayağını ağacların və kol-kosun seyrəldiyi yerə basınca şartaşartla onun lap qulağının dibindən bir-iki güllə keçdi.* Ə.Əbülhəsən.

**ŞARTHAŞART** *zərf* Güclü alovla, səslə (yanan quru ağac, odun və s. haqqında). *Qaratikanlar şarthaşart yanır, alovlanır, burula-burula göyü bürüyürdü.* Ə.Vəliyev.

**ŞARTILDAMA** "Şartıldamaq"dan *f.is.*

**ŞARTILDAMAQ** *f.* Şart-şart səs çıxarmaq. *Musiqi susan kimi toybəyinin zoğal qamçısı şart-şart şartıldayırdı.* Mir Cəlal.

**ŞART-ŞART** *təql.* Güllə və ya nazik çubuq, qamçı zərbəsinin səsinə təqlidən deyilir. *Birdən şart-şart bir neçə güllə səsi eşidildi.* Ə.Əbülhəsən.

**ŞASSİ́** [*fr.*] *tex.* 1. Müxtəlif maşın və qurğuların kuzovsuz çərçivəsi və ya özülü. *5 at gücündə olan motor maşını həm yedəkçi traktor kimi, həm də asma kənd təsərrüfatı alətləri ilə birlikdə motorlu şassi kimi işlətməyə imkan verir.* (Qəzetlərdən).

2. Müxtəlif cihazların, radioaparatlarının və s.-nin əsas hissələrinin üzərində quraşdırılan özülü.

3. Təyyarələrdə: göyə qalxıncaya qədər və enəndən sonra onların aerodrom üzərində hərəkətinə xidmət edən və yerə endikləri zaman zərbə gücünü azaldan qurğu, hissə.

**ŞAŞDIRMA** "Şaşdırmaq"dan *f.is.*

**ŞAŞDIRMAQ** *f.* Heyrətə salmaq, çaşdırmaq, sarsıtmaq. [Rzaquluxan:] *..Qızım, sənin adın yanımda çəkiləndə, arzu və amalımın natamam qaldığı gözümün önündə mücəssəm durur. Məni şaşdırıb qoyur.* M.S.Ordubadi.

◊ **Ağlını şaşdırmaq (çaşdırmaq)** – 1) ağlını əlindən almaq, dəli etmək. [Ustanın arvadı:] *A kişi, cin-zad səni vurub, ağlını-zadını şaşdırmayıb ki, hədərən-pədərən danışırsan.* Çəmənzəminli; 2) ağlı başından getmək, ağlı azmaq, başı xarab olmaq.

**ŞAŞIRMA** "Şaşırmaq"dan *f.is.*

**ŞAŞIRMAQ** *f.* Bir iş, bir hadisə və s. qarşısında özünü itirmək, çaşıb qalmaq, nə edəcəyini bilməmək. *Dilaranın səsinə çıxan anası da şaşırmışdı.* C.Cabbarlı. *Qız* [müəllimi] *görüncə, şaşırıb üzünü örtməyə tələsdikdə, səhəngini salıb qırmışdı.* S.Hüseyn.

**ŞAŞIRTMA** "Şaşırtmaq"dan *f.is.*

**ŞAŞIRTMAQ** *f.* Çaşdırmaq, karıxdırmaq. "*Cənab Bax*" *sözü pristavı da şaşırtdı, əllərini çırpdı, yerindən qalxdı.* Çəmənzəminli. *Ömür dedikləri sorsalar nədir? Xətləri qarışıq bir xəritədir; İnsanın gözünü şaşırdır bəzən...* S.Vurğun.

**ŞAŞKÁ** [*rus.*] Tiyəsi uzun, azca əyri, ucu şiş, kəsici soyuq silah; qılınc. *Şaşka taxmaq. – Zadeyi-Hacı Məlik tazə kvartalni olub; Belinin üstə asıbdır bir uzun şaşkanı.* S.Ə.Şirvani. [Süvari] *qotazlı şaşkanın dəstəsindən tutub sinəsinə yapışdırdı.* S.Rəhimov.

**ŞAŞKALI** *sif.* Şaşka taxmış, şaşka gəzdirən, şaşkası olan. *Şaşkalı zabitlərin ağır addımları döşəmədə fəlakət kimi səslənəndə evdə vaveyla ucaldı*. Mir Cəlal.

**ŞAŞQIN** *sif.* 1. Nə edəcəyini bilməyəcək dərəcədə fikirli, özünü itirmiş, çaşmış, çaşıb qalmış, qarıxmış, çaşqın. *Hikmət İsfahani ağır bir təəssürat altında saraydan çıxdı. Fikri şaşqın, qəlbi həyəcanlı idi*. M.İbrahimov. *Qız* [oğlanın] *şaşqın tərəddüdünü görüb gülümsədi.* İ.Əfəndiyev. // Zərf mənasında. *Gülzar bir şey axtaran və ya kömək gözləyən kimi, şaşqın o yan-bu yanına baxdı.* T.Ş.Simurq. *Gülyaz gecəyarısı şaşqın halda oyanıb, Səmədi evdə görmədi, onun haraya getdiyini dərhal anladı.* M.Hüseyn.

2. Sərsəm, ağlını itirmiş. [Qızlar:] *Şaşqındır o divanə; Gəl, gəl, oluruz rüsva*. H.Cavid. // *is.* Şaşqın adam. [Rauf:] *Əvət, şaşqınlar daim əsəbi və bədbin olurlar.* H.Cavid.

**ŞAŞQINCA** *zərf* Şaşqın kimi, çaşmış halda, dəlicəsinə. [Xəyyam:] *İştə, bir səs ki edər göylərə şaşqınca xitab; O sağır göy, əcəba, kimsəyə vermişmi cavab?* H.Cavid.

**ŞAŞQINLAŞMA** "Şaşqınlaşmaq"dan *f.is.*

**ŞAŞQINLAŞMAQ** *f.* Şaşqın hala gəlmək.

**ŞAŞQINLIQ** *is.* 1. Şaşqın adamın halı; çaşqınlıq. [Firidun] *böyük bir gərginliklə şaşqınlığını, həyəcanını və iztirablarını boğaraq, sərtiblə vidalaşdı.* M.İbrahimov. *Bircə qırpım sürən şaşqınlıqdan sonra gənc qız çevik bir hərəkətlə əlini atıb, çəkməsinin boğazından almaz kimi parıldayan kiçik, əyri bir xəncər çıxardı.* M.Rzaquluzadə.

2. Ağlını itirmə, sərsəmlik.

**ŞAŞMA** "Şaşmaq"dan *f.is.*

**ŞAŞMAQ** *f.* Özünü itirmək, çaşmaq, çaşıb qalmaq. *Nemət şaşdı və sənədi geri alıb baxmaq istədikdə cənab Bax vermədi*. Çəmənzəminli. *Mən isə bu iki qüvvə arasında şaşmış, tamamilə ağlımı itirmişdim*. T.Ş.Simurq.

**ŞATIR** *is.* [*ər.*] Çörəkbişirən, çörəkyapan, çörəkçi. [Bəndalı] *ustanı burada, xəmirxanada bir şatır olaraq tanımışdı.* Mir Cəlal. *Üzü pörtmüş şatır oxlovçunun verdiyi xəmiri əlindəki rəfətənin üstündə yayıb təndirə yapırdı.* P.Makulu.

**ŞATIRLIQ** *is.* Şatır işi, çörəkbişirmə peşəsi, çörəkçilik.

**ŞATİR** *sif.* və *zərf* [*ər.*] *klas.* Şən, şux. [Əhməd] *yenə nəşəsini toplamış, şən və şatir görünməyə alışmış olan siması sevinclər içərisində qalmışdı*. A.Şaiq.

**ŞAVA** bax **dava-şava**. [Hacı Mehdi:] *Övrət gətirdim, canıma bir od gətirdim. Axşamadək dava, axşamadək şava.* Ə.Haqverdiyev.

**ŞAYAN** *sif.* [*fars.*] *klas.* Layiq, münasib, yaraşan. *Səy elə, sən də böyük insan ol; Doğruluqda bu ada şayan ol*. A.Səhhət. *Kim bilir! Düşsə cənnətə yolunuz; Bulunur bəlkə boylə bir sima... O da şayani-şübhədir, əlbət.* H.Cavid. *Hər aşiqə ümmid günü var olsa qiyamət; Gül onda da sən, vəslinə şayan ola bilsən*. C.Cabbarlı.

**ŞAYANİ-DİQQƏT** *sif. köhn. kit.* bax **diqqətəlayiq**.

**ŞÁYBA** [*alm.*] 1. *tex.* Vint və ya qaykanın altına qoyulan yastı halqa şəklində altlıq. *Dairələr bölməsinə şaybalar, pistonlar, dişli çarxlar, makaralar, qasnaqlar və sairə daxildir.* Ə.Mustafayev.

2. *idm.* Xokkey oyununda işlədilən ağır rezin disk.

**ŞAYƏD** *bağl.* [*fars.*] Bəlkə. *Mən ağlayıram, yatmaya ta mərdumi-aləm; Əgər mən Məşədi Qulamhüseyni yaxşı tanımamış olsaydım, xəyalıma gələrdi ki, şayəd yalan deyir.* C.Məmmədquluzadə.

**ŞAYƏSTƏ** [*fars.*] *klas.* Layiq, yaraşan. [Şah:] *Sən tədbirli kişisən, belə danışıq sənə şayəstə deyil.* Ə.Haqverdiyev. [Mirzə Rəhim ağa:] *Nə qədər ki, bu naməhrəmlik vardır, sənin işinə baxa bilmərəm. Çünki xilafi-şərdir. Şəriətmədarlara bu iş şayəstə deyil*. M.S.Ordubadi.

**ŞAYİƏ** *is.* [*ər.*] Yayılmış, dillərdə gəzən danışıq, söz-söhbət. ..*Qızıl Arslanı yaxından tanıyanlar onun Qətibə ilə evlənəcəyi haqqında buraxılan şayiələrin heç birisinə inanmırdı*. M.S.Ordubadi.

**ŞE** "Ş" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**ŞEDEVR** *is.* [*fr.*] İncəsənətin, ədəbiyyatın, sənətin ən nümunəvi əsəri, şah əsər.

**ŞEF** [*fr.*] 1. Başçı, rəis, rəhbər. *Katib bir az dayandı, sonra şefini çox hirsləndirməmək üçün ehtiyatla dedi.* S.Rəhman.

2. Bir şəxsə və ya şeyə hamilik etməyi öhdəsinə götürmüş adam və ya təşkilat.

*Yaralılardan bir neçəsi çıxış edib, hospitalın şefi olan fabrikə təşəkkür etdikdən sonra, danışmaq üçün Dursun arvada söz verildi.* Ə.Əbülhəsən.

**ŞEFLİK** *is.* İstehsal, mədəni, siyasi və s. cəhətdən müntəzəm yoldaşlıq köməyi göstərməkdən ibarət ictimai fəaliyyət, hamilik. [Toğrul:] *Mən o qızı tovlamaq istəyirdim, mən* [Niyazı və Yaqutu] *ata-bala şefliyə götürmüşdüm.* C.Cabbarlı. [Fərəc Telliyə:] *Bizim elmi tədqiqat bağçılıq institutu sizin kolxozu şefliyə götürəndə bulaq başında nitq deyən kim idi?* Ə.Məmmədxanlı.

**ŞEH** *is.* Rütubətli havada gecələr torpaq, bitki və s.-nin üzərinə qonan incə su damcıları; qırov, şəbnəm. *Yumşaq göy çəmənin üstə düşüb şeh gecədən; İsti yoxdur, hələ var bir balaca meh gecədən.* A.Səhhət. *Şeh düşər otların üstə gecədən.* S.Vurğun. *..Üstünü şeh və qırov basmış körpə otlar Günəşin işıqları altında parıldayırdı.* M.İbrahimov.

**ŞEHDURAN** *is. bot.* Gülçiçəklilər fəsiləsindən yüksək dağ çəmənlərində bitən bir bitki. *Gülçiçəklilər fəsiləsinin bir-birindən az fərqlənən cavan növləri vardır. Belə cavan və filogenetik inkişafda olan cinslərə yemişan, gül və itburnu, böyürtkən, qaytarma, şehduran və sair cinslər daxildir.* M.Qasımov.

**ŞEHLƏNMƏ** "Şehlənmək"dən *f.is.*

**ŞEHLƏNMƏK** *f.* Üstü şehlə örtülmək, üstünə şeh qonmaq.

**ŞEHLİ** *sif.* 1. Üzərində şeh olan, üzərinə şeh düşmüş. *Şehli kollar. Şehli otlar. – Ovçu Piri, lap ayağının ucundan qalxıb yaxındakı şehli yovşan koluna qonan çobanaldadandan gözünü çəkib başını qaldır*(*dı*).. İ.Əfəndiyev. *Şehli çəmənlərdə qaçdığım anlar; Yadıma islanmış tellərim gəlir.* M.Dilbazi.

2. *məc.* Tər, təzə, təravətli. *Şehli meyvələr.*

**ŞEHLİK** 1. B a x **şehli** 1-ci mənada. *Şehlik və nəmişlik gündə duza artıq meyil edən təpəl camış müti bir qul kimi Qaraxana baxmağa başlardı.* S.Rəhimov.

2. *məc.* Təzə, tər, təravətli. *Gəncliyin ən şehlik və təravətli vaxtlarını müsəlmanların qorxusundan damın altında keçirmişəm.* Çəmənzəminli.

**ŞEİR** *is.* [*ər.*] Ritmik vəzndə ahəngdar poetik əsər, nəzmə çəkilmiş bədii əsər. *Klassik şeir. – Vaqif yolunun davamçısı olan Zakir şerimizə həqiqi satira gətirmişdir.* A.Şaiq.

**ŞELF** [*ing.* shelf] *coğr.* Materikin [qurunun] su altında 200 metrə qədər dərinlikdə olan davamı, hissəsi. *Adaların bir qismi şelfin qalxması nəticəsində əmələ gəlmişdir.* M.Qaşqay.

**ŞELLÁK** *is.* [*holl.*] Heyvan mənşəli təbii qatran.

**ŞELLƏNMƏ** "Şellənmək"dən *f.is.*

**ŞELLƏNMƏK** *f.* Sevinmək, fərəhlənmək.

**ŞENLİK** *is.* Abad yaşayış yeri, ümumiyyətlə, məskun yer, məntəqə; qəsəbə. [Arazgili] *şenliyin qırağında, gözəl mənzərəli bir yerdə kiçik otaq tutdular.* A.Şaiq. *..Təklikdə davam eləməyib,* "*öldürsə də, qoy məni həmcinsim öldürsün*" *deyib, meşəni tərk etdim, şenlik olan tərəfə rəvan oldum.* A.Divanbəyoğlu. *Qərib qış axşamları yollara qar yağanda; At sürüb bir şenliyə, gecələdim Muğanda.* Ə.Cəmil.

**ŞENLİKSİZ** *sif.* Adam az olan, əhalisi az olan. [Ana:] *Bala, məktəbə gedəndə həmişə küçənin ortası ilə get-gəl, şenliksiz küçəyə ayaq basma.* Çəmənzəminli.

**ŞENYON** *is.* [*fr.*] 1. Başın arxasında toplanmış saç tellərindən düzəldilmiş qadın saç düzümü.

2. Yapma saç maskası.

**ŞERİYYƏT** *is.* [*ər.*] Bədiilik, ahənglilik, gözəllik, emosionallıq. *Əsil məharət də bundan ibarətdir ki, ifaçı çaldığı musiqi əsərini yüksək şeriyyətlə mənalandırsın.* Ə.Bədəlbəyli.

**ŞEİRLƏŞMƏ** "Şeirləşmək"dən *f.is.*

**ŞEİRLƏŞMƏK** *f.* Şeir deməkdə bir-birilə yarışmaq.

**ŞEŞ¹** *is.* [*fars.*] Altı. *Dünən beş, bu gün şeş.* (Məsəl). // Nərd oyununda. *Çahar atdım, şeş gəldi.* (Məsəl).

**ŞEŞ²** *is.* Top, tüfəng lüləsinin içindəki halqavari cızıqların hər biri; yiv, xır. *Şeşi getmiş tüfəng.*

**ŞEŞ-BEŞ** *is.* Nərd oyununun başqa bir adı. *Gəl bir şeş-beş oynayaq.* – [Şikayətçi:] *Nə vaxt* [ipək idarəsinə] *müdirin yanına gedirsən, görürsən ki, kişi oturub şeş-beş oynayır. Elə ki əli gətirmədi, vay o günü onu axtaranların halına.* C.Gözəlov.

**ŞEŞDRƏNGİ** *is.* [*fars.*] 1. Altı cür xuşgəbardan (kişmiş, qurağa, albuxara və s.)

hazırlanan plov xuruşu. [Xanım:] *Qəsdim lap şeşdrəngi xörək etməkdir, abırlı olsun.* S.Rəhimov.

2. *məc.* Dikbaş, lovğa, iddialı, təkəbbürlü.

**ŞEŞƏ** *sif.* Dik, sivri. [Vaqif:] *Niyə, qulağınız çoxdan şeşədir; Böhtan eşidəndə qızarıb yanar; Doğru söz gələndə pambıq tıxanar.* S.Vurğun. *Qubernator dəstəsilə gəldi. Atın üstündə şeşə bığlarına əl vurmadan "millət naminə" bir nitq söylədi.* Mir Cəlal.

**ŞEŞƏBIĞ** *sif.* Bığlarının tükləri cod və dik olan. *Şeşəbığ kişi. – Hərdənbir poqonlu, şeşəbığ, çəkməsi məhmizli, başıaçıq adamlar çadırdan görünür, yenə səsin içinə batırdılar.* Mir Cəlal.

**ŞEŞƏBUYNUZ** *sif.* Dikbuynuz, itibuynuz. *Zərrintac xanım, Leyləyi öz nəzərindən rədd etdikcə, yaşı ötən şeşəbuynuz bir öküz kimi hey irəliyə dürtülürdü.* S.Rəhimov.

**ŞEŞƏLƏMƏ** "Şeşələmək"dən *f.is.*

**ŞEŞƏLƏMƏK** *f.* Dikəltmək, dik saxlamaq, iti tutmaq. *Qulaqlarını şeşələmək.*

**ŞEŞƏLƏNMƏ** "Şeşələnmək"dən *f.is.*

**ŞEŞƏLƏNMƏK** *f.* Acıqlanmaq, qışqırmaq, sərt söz demək, qabarmaq, xoruzlanmaq. [Sədr:] *Bu ixtiyarı sənə kim verib? – deyə o, Xəlilin üstünə şeşələndi.* M.Hüseyn. [Cahandar ağa oğluna:] *Ə, qoduq, mənim üstümə şeşələnirsən?* İ.Şıxlı.

**ŞEŞƏLƏTMƏ** "Şeşələtmək"dən *f.is.*

**ŞEŞƏLƏTMƏK** b a x **şeşələmək**. *Şeşələtdi bığlarını; Gözlərin rövşən elədi.* Aşıq Ələsgər.

**ŞEŞƏLİK** *is.* Lovğalıq, dikbaşlıq, təşəxxüs.

**ŞEŞLİ** *sif.* İçində şeşi olan, yivli, xırlı. *Şeşli lülə.*

**ŞEŞPƏR** *is.* [*fars.*] Altıdilli toppuz – qədim silah. [Dəmirçioğlu:] *Mən onun nə qılıncından qorxuram, nə şeşpərindən.* "Koroğlu". *Keçdi xəyalından əlində şeşpər; Qıratın belində baban Koroğlu.* Ə.Ziyatay.

**ŞEVALYÉ** *is.* [*fr.*] Feodal Fransada zadəgan rütbəsi.

**ŞEVRÉT** [*fr.* shevrette – çəpiş] Qoyun dərisindən hazırlanmış sevroya oxşar dəri. *Qoyun dərilərini .. xrom duzu vasitəsilə aşıladıqda ona şevret deyilir.* A.Quliyev.

**ŞEVRÓ** [*fr.*] Keçi dərisindən hazırlanan yumşaq, zərif dəri növü. // Həmin dəridən tikilmiş. [Cavad] *ipək arxalıq, mahud çuxa, boz və qiymətli Buxara dərisindən papaq, şevro çəkmə, belində qızıl kəmər, döşündə çarpaz asılmış qızıl saat zənciri .. onun libası həmişə bu idi.* Ə.Haqverdiyev.

**ŞEVRON** *is.* [*fr.*] Rəsmi geyimin qoluna vurulmuş bucaqşəkilli tikmə.

**ŞEVYÓT** [*ing.* yer adından] Yüngül, yumşaq, incə xovlu yun və ya yarıyun parça növü. *Mağazadan üç metr şevyot aldım.* // Şevyotdan tikilmiş. *Şevyot kostyum. – Baş aqronom ayağa qalxanda, qara şevyot şalvarının qalifeyi körük kimi şişib boşaldı.* Ə.Vəliyev. [Dilbər] *əynindəki göy şevyot pencəyini çıxarıb məhəccərin üstünə atdı.* Ə.Sadıq.

**ŞEY** *is.* [*ər.*] 1. Məişətdə, işdə və s.-də lazım olan hər hansı bir cisim, maddə, zad, əşya, nəsnə. [Əsgər:] *Xanım, sizə yaraşan şeyim çoxdur, ancaq evdədir.* Ü.Hacıbəyov. *Müəllimin böyründə qəzetə sarılı iki şey vardı.* Ə.Vəliyev. [Qulu:] *Otaq təmizdir. Ancaq şeyimiz yoxdur ki, qoyaq.* N.Nərimanov. ☐ **Bir şey** – 1) qeyri-müəyyən, qeyri-məlum şey, hadisə və s. *Sənə bir şey verdimi? Bazardan bir şey ala bildin? Bir şey bilə bildinmi? Ona bir şeymi olub?* 2) əhəmiyyət bildirir. *Elə demə, o da bir şeydir, lazım olar.* // Adətən cəm şəklində – özünə məxsus pal-paltar və s. *Şeylərini zalın küncünə yığıb, özləri də baxırdılar camaata.* Ə.Haqverdiyev. *Rübabə yəqin elədi ki, Vahid şeylərini yığışdırıb yola düşüb.* Mir Cəlal. // Bir yerdən başqa yerə aparmaq üçün yığılıb bağlanmış yük, çamadan və s. *Şeyləri maşına yığmaq. Şeyləri baqaja vermək. – Yenə* [hambal] *şeyləri götürüb qabağa düşdü.* Ə.Haqverdiyev.

2. *dan.* Ədəbi, bədii, elmi və s. əsər. *Bir dənə də olsun iri şey yazmamışdır. Yazdıqları elə bir şey deyil.*

3. Fakt, iş, real hadisə. *Qeyri-adi şey. Məsələyə ciddi bir şey kimi baxmaq lazımdır. Belə şeylərə yol vermək olmaz. Belə bir şey başıma gəlib.*

4. İş, hərəkət, əməl. *Belə şeylərə baş qoşma. Bu kimi şeyə mən razı ola bilmərəm.* ☐ **Heç bir şey** – heç nə.

**ŞEYDA** *sif.* [*fars.*] *şair.* Dəlicəsinə vurğun, eşq divanəsi, məftun (bəzən "şeyda bülbül" tərkibində işlənir). *Vaqif bir şeydadır, dolanır bağı; Xəstədir, dərmanı dilbər dodağı.*

M.P.Vaqif. *Qonub pəncərəyə bu halda Osman; Şeyda bülbül kimi edirdi əfğan.* H.K.Sanılı. [Vaqif:] *Oxu bu naməni, əzizim Eldar; Qoy mənim dərdimi dinləsin dağlar; Bir tərlan xəyallı, qəlbi xəstəyəm; Bir şeyda bülbüləm, daş qəfəsdəyəm.* S.Vurğun. ◻ **Şeyda olmaq** – dəlicəsinə vurulmaq, məftun olmaq. *Zimistan qəhrini çəkən bülbüllər; Şeyda olsun, gülüstana can desin.* Aşıq Ələsgər.

**ŞEYDABAZ** *is.* [*fars.*] Arvadbaz. *Molla şeytan idi, axund şeydabaz; Məşədi, kablayı lotu çıxmışdı.* Aşıq Ələsgər.

**ŞEYDALIQ** *is.* Dəlicəsinə vurğunluq, aşiqlik, məftunluq, eşq və məhəbbətdən irəli gəlmiş divanəlik. *Şeydalığım oldu aləmə faş; Nifrət qılar oldu yarü yoldaş.* Füzuli.

**ŞEYHƏ** *is.* Atın bərk kişnəməsi. *Birdən ayıldım, duydum bir bağırtı; Xəncər bərqi, at şeyhəsi, çığırtı.* A.Səhhət. // Qışqırıq, bağırtı. ◻ **Şeyhə çəkmək** – bərkdən qışqırmaq.

**ŞEYX** *is.* [*ər.*] 1. Ərəbistanda qəbilə və ya əşirət başçısı. *Digər şeyxlər və müridlər də gəlib birər-birər* [*dərvişin*] *ətrafına toplaşırlar.* H.Cavid.

2. Təriqət başçısı və hər hansı bir təriqətə mənsub olub orada ibadətlə məşğul olan, dərvişlərə başçılıq edən şəxs. *Şeyxlər meyxanədən üz döndərərlər məscidə.* Füzuli. *Bir gün şəhərdə belə şayiələr dövran edirdi ki, guya üsulilər ilə şeyxlərin davası olacaq.* Çəmənzəminli.

3. Pirə baxan, pirdə nəzir yığan adam. *Pirin şeyxi qısaboylu, qarnı və peysəri yoğun, ağbənizli, uzunsaqqal bir molla idi.* E.Sultanov.

**ŞEYXƏNA** *is.* [*ər.*] Ey şeyx, şeyximiz (şeyxə hörmətlə müraciət). [Hacı Həsən:] *Şeyxəna, doğrusu, mən övladdan sarı bədbəxt olmuşam, bir qələtdir eləmişəm.* C.Məmmədquluzadə.

**ŞEYXÜLİSLAM** *is.* [*ər.*] Müsəlmanların dini işlərinə baxan baş ruhani. *Həmin günün axşamı Tiflisdə iqamət edən Zaqafqaziyanın şeyxülislamı rus dilində ... bir teleqram aldı.* E.Sultanov. // Şiələrin baş ruhanisi. *Şiələrin ruhani idarəsinin rəisi şeyxülislamdır.* M.F.Axundzadə.

**ŞEY-MEY** *dan.* bax **şey-şüy**. *Nuşapəri xanım aşpazdan ayrılıb, şey-meyini götürüb getdi.* (Nağıl).

**ŞEYPUR** *is.* Əyri boru şəklində ağzıgen musiqi və ya siqnal aləti. *Bayraq çadırdan çıxarıldığı zaman şeypur səsləri ucaldı, atlılar bir kərə qılınclarını qınından çıxardılar.* M.S.Ordubadi. *Xanın buyruğu ilə şeypurlar çalındı.* M.Rzaquluzadə.

**ŞEYPURBURUN** *sif.* Burnunun deşikləri iri və çevrik olan. *Şeypurburun adam.*

**ŞEYPURÇALAN, ŞEYPURÇU** *is.* Şeypur çalan çalğıçı, şeypurla siqnal verən. *Musiqi komandasının şeypurçusu.*

**ŞEY-ŞÜY** *is.* Hər cür lazımi şeylər, avadanlıq, müxəlləfat və s. [Kərbəlayı Fatma xanım:] *Ay qız, hələ tələsmə. Qoy hələ görək. Gedib şey-şüyü gətirib bura tökmə.* C.Məmmədquluzadə. [Qız:] *Getdim, çağırdım, dedim ki, kooperativdə şey-şüy verirlər.* Qantəmir.

**ŞEYTAN** *is.* [*ər.*] 1. Dini təsəvvürlərə görə şəri təmsil edən mövhum varlıq; cin, iblis (dini əfsanələrə görə mələklərdən olub, guya Adəm peyğəmbərə səcdə etmədiyinə görə göydən qovulmuş və o zamandan bəri insanları pis yollara çəkməyə çalışan bir varlıq). *Ayda-ildə bir namaz, onu da şeytan qoymaz.* (Məsəl). *Səcdə qıl yarə, könül, baxma o zahid sözünə; Adəm ol, mətləbi qan, eyləmə şeytan ilə bəhs.* S.Ə.Şirvani. *Artıq nə molla var, nə cin, nə şeytan; Nə yumruq, nə qamçı, nə nökər, nə xan.* S.Vurğun.

2. *məc.* Araqarışdıran, fitnəkar, xəbərçi, çuğul adam haqqında. [Nəsir:] *Şeytana rast gəlməsən, nə var ki.* H.Nəzərli. [Qəhrəman:] *Sən demə, şeytan-şuğul bunu bəyə xəbər verib.* Ə.Vəliyev. // *məc. zar.* Çox bic, kələkbaz. [Əsgər:] *Halal olsun, Süleyman, sən nə kələkbazsan, şeytan! Öyrədib məni yola saldın, mənə rast gəldi yarcan.* Ü.Hacıbəyov. // *məc.* Dəcəl. *Şeytan bir qız nəvəsi də; Ayaq üstə dayanmışdı.* N.Rəfibəyli.

◊ **Şeytan fəhləsi** – yorulmadan havayı, müftə işləyən adam haqqında. [Molla Cəfər Qasım əmiyə:] *Gərək düşəsən bu kənd mənim, o kənd sənin, arvadın nə qədər qohum-qardaşı, cicisi, bacısı .. hamısını daşıyıb tökəsən Danabaş kəndinə. Kişi, sən şeytan fəhləsisən məyər?* C.Məmmədquluzadə. **Şeytana bac vermək** – biclik, hiylə işlətmək. **Şeytana papış tikər** – çoxbilmiş, çox bic, hiyləbaz,

fırıldaqçı adam haqqında. [Ağa Kərim:] *Amma Ağa Salmana mənim təlimim lazım deyil. O özü şeytana papış tikər*. M.F.Axundzadə. *Sənin bicliyini kim bilmir, sən az qalırsan ki, şeytana papış tikəsən, sən mətləbi başa düşmürsən?* E.Sultanov. **Şeytanın ayağını (qıçını) sındırmaq** *zar.* – çox az-az bir yerə gəlib-getmək, hərdənbir görünmək. *Cabir məni hərdən yada salırdı. ..Ayda arabir şeytanın qıçını sındırırdı.* Ə.Vəliyev. **Bu meydan, bu da şeytan** – hər hansı bir şeyi sübut etmək üçün əsas, dəlil göstərmək mənasında ifadə. [Bəxti:] *Deyin görək, mən kimə nə eyləmişəm? Bu meydan, bu da şeytan, bu göydəki allah, bu yerdəki insanlar.* S.Rəhimov. **Lənət kor şeytana** – b a x **lənət sənə kor şeytan!** (“**lənət**”də).

**ŞEYTANAĞACI** *is. bot.* İynə kimi tikanları olan bəzək ağacı. *Şeytanağacı 20 metr hündürlüyündə, iri və budaqlanan tikanlara malik, qışda yarpağı tökülən ağacdır. Xırda çiçəkləri may-iyun aylarında açılır, iri meyvələri sentyabrda yetişir və bütün qışı ağacdan asılı şəkildə qalır*. H.Qədirov.

**ŞEYTANCASINA** *zərf* Şeytan kimi; iblisanə, xaincəsinə.

**ŞEYTANÇILIQ** *dan.* b a x **şeytanlıq**.

**ŞEYTANDIRNAĞI** *is.* Dırnağın dibində siyrilmiş dəriciklər.

**ŞEYTANDOLAŞIĞI** b a x **şeytandüyünü**.

**ŞEYTANDÜYÜNÜ** *is.* Çox çətin açıla bilən düyün. *İpə lap şeytandüyünü vurmusan.*

**ŞEYTANFİKİR** *sif.* [*ər.*] Fikri-zikri adamlara pislik etmək, araqarışdırmaq, fitnə-fəsad salmaq, iblislik etməkdən ibarət olan adam haqqında. [Bayram:] *Namaz bir tamahkar, şeytanfikir adamdır.* M.F.Axundzadə.

**ŞEYTANI[1]** *is.* Tətik (odlu silahda). [Vəli Tarverdiyə:] *..Əgər ayaq geri qoysan, şeytanını çəkib qarnını tüstü ilə doldurram.* M.F.Axundzadə. *Onlar dayanıb özlərini toxtatdılar. Hər ikisinin əli birdən tüfənglərin şeytanını çəkdi, qoşagüllə Heydəri yerə sərdi.* S.Rəhimov.

**ŞEYTANI[2]** *is. tib.* Kişilərdə adətən yuxuda qeyri-iradi olaraq toxumtökmə hadisəsi. *Şeytanı olmaq.*

**ŞEYTANİ[3]** *sif.* [*ər.*] Şeytana xas olan, şeytana layiq olan; şeytancasına, ibliscəsinə. [Yaşlı kişi:] *Şeytani fikirlər bir anda başımdan silinib getdi*. S.Hüseyn.

**ŞEYTANLAMA** “Şeytanlamaq”dan *f.is.*

**ŞEYTANLAMAQ** *f.* Gizli olaraq vermək, xəbər aparmaq, casusluq etmək, çuğullamaq, satmaq. [Mehdi:] *Məni şeytanladılar*. C.Cabbarlı. *Elə bu vaxtlar o, kooperativ müdiri olan otuz yaşlı qardaşını şeytanladı*. Ə.Əbülhəsən.

**ŞEYTANLIQ** *is.* Xəbərçilik, casusluq, çuğulluq. [Dəmirqaya:] *Mirzəağa məni aldadıb. O casusdur. Mən onun etdiyi şeytanlıqlara şahidəm.* H.Nəzərli. ◻ **Şeytanlıq etmək (eləmək)** – xəbərçilik etmək, çuğulluq etmək, casusluq etmək, xəbərçiliklə, çuğulluqla məşğul olmaq, şeytanlamaq. [Namaz:] *İndi məlum olur ki, belə ustalıq ilə söz qayırmaq, şeytanlıq eləmək onların işi imiş*. M.F.Axundzadə. [Həsən:] *Sən bir fikir elə, qol saatın ilə bilərziyini aparsam, Allahın izniylə on pud qənd alaram, heç də gətirib burada satmaram ki, şeytanlıq edib tutdursunlar.* Qantəmir. [Sərvinaz:] [Fətişin] *şeytanlıq eləyib, camaatı nahaqdan tutdurmasından deyəydi.* İ.Əfəndiyev.

**ŞEYTANSİFƏT** *sif.* [*ər.*] Şeytana oxşayan, şeytan kimi, şeytan xasiyyətli. [Sənəm:] *Kişi, keçən keçibdir, Allah şeytana, şeytansifətə lənət eləsin.* Ə.Haqverdiyev.

**ŞEYTANŞAPALAĞI** *is.* Çox balaca adam haqqında. *Bu kişi lap şeytanşapalağıdır.* – [Oğlan:] *Bir bunun sir-sifətinə bax, elə bil ki, şeytanşapalağıdır.* P.Makulu.

**ŞEYTAN-ŞEYTAN** *zərf* Bic-bic. *Pərşan .. gah xəyala gedir, gah da şeytan-şeytan Qaraşa baxaraq pıçıldayırdı.* M.İbrahimov.

**ŞEYTAN-ŞUĞUL** *is.* Xəbərçi, çuğul, adamsatan. *El-oba Nəbini öz gözünün didəsi kimi qoruyub saxlasa da, Sarımsaqoğlu kimi şeytan-şuğul qızıl vədindən ötrü işə girişirdi.* S.Rəhimov. [Xalıqverdi Paşa bəyə:] *Mənim haqqımda deyilənin hamısı şeytan-şuğul sözüdür*. Ə.Vəliyev.

**ŞEYTƏNƏT** [*ər.*] *klas.* Şeytanlıq, iblislik; hiylə, fitnə, fəsad. [Bu ləkə] *Naxçıvan ilə Lənkəran qulluqçularının içinə çox vaxtdan bəri düşən şeytənət ləkəsidir.* C.Məmmədquluzadə. *Otellonun poruçiki, Yaqo ki onun ziri-dəstində qulluq edirdi, öz ağasından narazı idi. Narazılığına ümdə səbəb onun zatında olan .. şeytənət, büxl və həsəd idi.* F.Köçərli.

**ŞEZLONQ** *is.* [*fr.*] Yüngül, mütəhərrik kreslo.

**ŞƏB** *is.* [*ər.*] *köhn.* Gecə.

**ŞƏBAB(ƏT)** *is.* [*ər.*] *klas.* Gənclik, cavanlıq. *Fəqət bahari-şəbabımda bir çiçək buldum; Qaçırdım əldən, onun həsrətilə məhv oldum.* H.Cavid. [Əmir qızlara:] *Bir nəğmə çalın, həm oxuyun qəlbimi şad eyləyəsiz; Həm şəbabətdə keçən günləri yad eyləyəsiz.* Ü.Hacıbəyov. *Qocaldım, gedibdir zamani-şəbabım; Alınmaz sualım, verilməz cavabım.* Ə.Nəzmi. ◻ **Şəbabətə yetmək** – gənclik dövrünə yetmək (ayaq basmaq), cavanlıq dövrü başlamaq. *Cavan qızın sinni şəbabətə yetmişdi. Zahir və batində çocuqluq əsərləri məhv olub gedirdi.* Çəmənzəminli.

**ŞƏBAHƏT** *is.* [*ər.*] Oxşarlıq, bənzərlik. *Hamısı kafirə bənzər o haramzadələrin; Nə müsəlmanlığa onlarda şəbahət var idi.* M.Ə.Sabir. *Bu uşaqların yalnız adında yox, sifətində və taleyində də şəbahət gördü.* Mir Cəlal.

**ŞƏBAN** *is.* [*fars.*] Qəməri ərəb təqvimində səkkizinci ayın adı. *Həmişə şəban, bir yol da ramazan.* (Məsəl). *Şəbanda gərçi bir neçə gün içmədim şərab.* S.Ə.Şirvani. *İndi şəbanın onun idi.* S.Hüseyn.

**ŞƏBBU, ŞƏBBUGÜLÜ** *is.* [*fars.*] Axşamçağı və gecə ətirsaçan rəngbərəng gül; mixəkgülü. *Şəbbugülü Azərbaycanda geniş becərilən ətirli bəzək bitkilərindəndir.* H.Qədirov. *Xiyabanın hər iki tərəfini xeyri, şəbbu, qırmızı zanbaq və sair rəngarəng çiçəklər bürümüş idi.* M.S.Ordubadi.

**ŞƏBÇİÇƏK** *is. bot.* Gecələr açılan çiçək növü. [Nisə xanım:] *Sənin üçün buket bağlamaq istəyirdim. Sədəf, amma nə qərənfil tapdım, nə şəbçiçək.* Ə.Məmmədxanlı.

**ŞƏBƏDƏ** *is.* [*ər.*] Rişxənd, ələ salma, araya qoyma; hoqqabazlıq. [Knyaz:] *Yapdığın şəbədələr gizli deyil.* H.Cavid. ◻ **Şəbədə qoşmaq, şəbədəyə qoymaq** – rişxənd eləmək, ələ salmaq, söz qoşmaq. [Hüseyn:] *İndi mənim dalımca şəbədə qoşanlar, məni hoydu-hoyduya götürənlər o zaman Hüseyn Xələfov adı gələndə ayağa durarlar.* S.Rəhman.

**ŞƏBƏDƏBAZ** *is.* və *sif.* [*ər.* şəbədə və *fars.* ...baz] Hoqqabaz, adam ələ salan, adamı lağa qoyan, adamoynadan, adama söz qoşan. *Bu növ artistlərin yeri şəbədəbazlar məclisidir.* Ə.Haqverdiyev.

**ŞƏBƏKƏ** *is.* [*ər.*] 1. Ağacdan, metaldan, daşdan, məftildən qayrılmış tor, hörgü, barmaqlıq; ornament. *Pəncərə şəbəkəsi. Qapı şəbəkəsi.* // Toraoxşar, toru xatırladan şey; tor.

2. Hər hansı bir yerdə müxtəlif istiqamətlərdə yolların, rabitə xətlərinin, kanalların və s.-nin məcmusu. *Dəmiryol şəbəkəsi. Elektrik şəbəkəsi. Telefon xətlərinin şəbəkəsi.*

3. Hər hansı bir ərazidə yerləşən oxşar idarələrin, müəssisələrin və s.-nin məcmusu. *Müalicə şəbəkələri. Ticarət şəbəkəsi.*

**ŞƏBƏKƏÇİ** *is.* Şəbəkə (1-ci mənada) ustası; ornamentçi.

**ŞƏBƏKƏÇİLİK** *is.* Şəbəkə kəsmə, şəbəkə qayırma sənəti.

**ŞƏBƏKƏLİ** *sif.* Şəbəkə şəklində qayrılmış, şəbəkə qoyulmuş, şəbəkəsi olan. *Şəbəkəli qapı. Şəbəkəli divar. Şəbəkəli pəncərə. – Bu gecə dəmir şəbəkəli qoşa pəncərədən işıq süzülmürdü: artırma da, həyət də qaranlıq idi.* İ.Məlikzadə.

**ŞƏBGÜLÜ** *is. bot.* Sarı, mixəyi rəngdə çiçəkləri olan çoxillik bitki; sarıbənövşə. *Sarıbənövşə və ya şəbgülü .. açıq-sarı, tünd-sarı, mixəyi, tünd-mixəyi rəngli və kəskin xoşiyli çoxillik bitkidir, bağlarda və güllüklərdə becərilir.* M.Qasımov.

**ŞƏBXUN** *is.* [*fars.*] Gecə vaxtı düşmən üzərinə gözlənilməz basqın. *Dəstə bir yerdə şəbxun atır, o biri yerdə özünü göstərir və birdən yox imiş kimi çəkilib itirdi.* S.Rəhimov. [Nəriman] *düşmən dəstələrinin hissəyə soxulduğunu və şəbxun vurduğunu yəqin edib daldanacaq aradı.* Mir Cəlal.

**ŞƏBİH** *is.* [*ər.*] 1. *klas.* Bənzər, oxşar. *Şəbihi yoxdur.*

2. *din.* Keçmişdə: məhərrəm ayında aşura günü şiələrin göstərdikləri Kərbəla hadisələrinə həsr olunmuş faciəli tamaşa, mərasim. *Camaat dörd ətrafda oturardı, şəbih göstərərdilər. Bu şəbihlər teatr tamaşalarını xatırladırdı.* H.Sarabski. [Ağa:] *Nəbiqulu məsləhət gördü ki, onunla birləşib Dəcəlləbadın meydanında şəbih çıxardaq.* Ə.Haqverdiyev.

**ŞƏBİHGƏRDAN** *is.* [*ər.* şəbih və *fars.* gərdan] Şəbihi hazırlayan, şəbih mərasimini idarə edən adam. *Cəm olunan pullar nəyə sərf olunardı? – Çaya, qəndə, .. imam yolunda*

*çalışan hədsiz Allah bəndələrinə ki ibarət olsun məscid və minbər xadimlərindən, şəbihgərdan dəstələrindən...* C.Məmmədquluzadə.

**ŞƏBİHGƏRDANLIQ** *is*. Şəbihgərdanın işi, şəbih mərasimini idarə etmə. *Şəbihgərdanlıq tam mənası ilə xalq teatrı idi.* Çəmənzəminli. // *məc.* Oyunbazlıq, hoqqabazlıq.

**ŞƏBKORLUQ** *is.* bax **gecəkorluq**.

**ŞƏBKÜLAH** *is.* [*fars.*] *köhn.* Gecəpapağı. [Kərbəlayı Həsən] *.. şəbkülahını geyinib arvada tapşırdı ki, bu gecə ölülər gələcək, .. dava-şava olmasın.* Çəmənzəminli. [Molla Qasım:] *Hərdənbir şəbkülah da qoyardı.* H.Sarabski.

**ŞƏBNAMƏ** *is.* [*fars.*] İntibahnamə, bəyannamə. *Şəbnamələr hazır idi*. M.S.Ordubadi. *O, mizin üstünə şəbnaməni qoyanda əlahəzrət Hümayuni aynada onu görüb tutmuşdu.* P.Makulu.

**ŞƏBNƏM** *is.* [*fars.*] bax **şeh**. [Dərviş:] *Gül qonçasında şəbnəm parıldayan kimi,* [Ruqiyyənin] *dodaqları arasında dişləri almaz kimi parıldadı*. A.Divanbəyoğlu. [Əhməd:] *Yerə düşmüş şəbnəm hələ qurumamışdı*. T.Ş.Simurq.

**ŞƏBNƏMLİ** *sif.* Şəbnəm (şeh) düşmüş, şehli. *Şəbnəmli çiçəklər səhər çağları; Yaqut gözlərilə qəmzə satardı.* R.Rza.

**ŞƏBPƏRƏ** *is.* [*fars.*] 1. Yarasa, gecəquşu. *Şəbpərə gecə gəzər, gündüz gəzməz; Elə bilər, özü bilər, özgə bilməz*. (Məsəl). *..Azacıq tar olursa indi hava; Sevinir hər tərəfdə şəbpərələr; Aldanıb qafilanə rəqs eylər*. H.Cavid.

2. *məc*. Kor, işıqdanqorxan, mədəniyyət düşməni.

**ŞƏCƏRƏ** *is.* [*ər.*] Bir sülalənin, xanədanın və s. nəsil qollarını (qollu-budaqlı ağac şəklində) göstərən cədvəl. *Nəsil şəcərəsi.*

**ŞƏDDƏ** *is.* [*ər.*] 1. Bax **təşdid**.

2. Sapa düzülmüş mirvari, inci. *Qətibə əlini atıb, kiçik cəbədən bir şəddə iridənəli inci çıxarıb Səba xanımın boynuna saldı.* M.S.Ordubadi. *İri mirvarilər beş-altı şəddə; Danənin hərəsi bir findıq həddə..* H.K.Sanılı.

**ŞƏDİD** *sif.* [*ər.*] *klas.* Şiddətli, sərt, çox ağır. *..Nadanlığa yaşlı gözlərilə baxa-baxa biçarə Məryəm saraldı, soldu, bir gün də şədid həyatından aralanıb rahətliyə çıxdı*. Çəmənzəminli.

**ŞƏDİDLİK** *is.* Şiddətlilik, şiddət. *Bu təzyiq* [kişilərin qadınlar üzərində təzyiqi] *tarixin hər pilləsində bir şədidlikdə olmayıb və ayrı-ayrı qövmlərin dərəceyi-mədəniyyətlərinə bağlı deyildi.* Çəmənzəminli.

**ŞƏFA** *is.* [*ər.*] Xəstəlikdən qurtarma, sağalma, yaxşılaşma. *Şirin, meyxoş meyvələri; Min bir dərdə şəfa bağlar! Qoynu dolu səfa bağlar!* R.Rza. *Şəfqət! Nə ülvisən, şəfa səndədir; Ağır xəstələrə dava səndədir*. M.Rahim. ☐ **Şəfa tapmaq (bulmaq)** – xəstəlikdən qurtarmaq, sağalmaq. *Ol vaxt mənim əhvalım o qədər pis deyil idi və İvanov həkimin davalarını yeyib gündən-günə şəfa tapırdım*. C.Məmmədquluzadə. *Dedim:* “*– Əl atmasa həkim bıçağa; Xəstə şəfa tapıb, durmaz ayağa*”. M.Rahim. **Şəfa vermək** – sağaltmaq, xəstəlikdən qurtarmaq. *Ver şəfa ləbindən, yazığam, mənə; Zəhri-fəraqınla ağulanmışam.* Q.Zakir. *Ağlar da, için-için edə ah; Bu körpəmə sən şəfa ver, Allah!* A.Şaiq.

◊ **Şəfa evi** – bax **şəfaxana**. *Məktəblərə, şəfa evlərinə, yetim evlərinə ciblərindən pul çıxarıb verən üləmadır.* C.Məmmədquluzadə. **Allah şəfa versin** – xəstələrə sağalma arzusunu bildirən ifadə. [Xala Yunisə:] *Gördüm, bala, fağırın* [Yaqutun] *üzü-gözü çox yanıb, Allah özü şəfa versin.* Ə.Məmmədxanlı.

**ŞƏFABƏXŞ** [*ər.* şəfa və *fars.* ...bəxş] *klas.* bax **şəfaverici**.

**ŞƏFAƏT** *is.* [*ər.*] *klas.* Bir günahkarın bağışlanması və ya bir möhtacın ehtiyacının yerinə yetirilməsi üçün başqası tərəfindən edilən vasitəçilik, iltimas. // Rəhm, mərhəmət, şəfqət. *Ey əhli-şimal, bu azarın dərmanı kövkəbi-hürriyyətin şəfaətidir.* S.S.Axundov.

**ŞƏFAƏTÇİ** *is. klas.* Şəfaət edən, rəhm edən, mərhəmət göstərən, yazığı gələn, dərdinə əlac edən. *Hər kəs qəzet oxusa, istəyir müsəlman qəzeti, istəyir qeyri bir dildə, qiyamət günü ona şəfaətçi olmayacaq*. “Mol. Nəsr.”

**ŞƏFAXANA** *is.* [*ər.* şəfa və *fars.* ...xanə] *köhn.* Xəstəxana, müalicəxana. [Yusif Sərrac buyurdu:] *...Hər yerdə yollar təmir olunsun və lazımi məqamlarda və mənzillərdə körpülər və karvansaralar tikilsin və hər vilayətdə şəfaxanalar qayrılsın.* M.F.Axundzadə.

**ŞƏFAİYYƏ** *is.* [*ər.*] *köhn.* Səhiyyə, sağlamlıq. *..Rusların cəmi mülki idarələri millət vəkillərinin əlində idi ki, rusca həmin vəzi-idarənin adı Zemstvodur, məsələn: kəndlərin maarif işləri, şəfaiyyə işləri..* C.Məmmədquluzadə.

**ŞƏFALANMA** "Şəfalanmaq"dan *f.is.*

**ŞƏFALANMAQ** *f.* Şəfa tapmaq, sağalmaq. *Xəstə şəfalanar təri gələndə; Təbib ona yönü bəri gələndə.* A.Şəmşir.

**ŞƏFALI** *sif.* Şəfa verən, şəfaverici, sağaldıcı. *Şəfalı hava. Şəfalı əl. Günəşin şəfalı şüası. – Bilmirəm, İsti suyun; Şəfalıdır qaynağı; Yoxsa onun hüsnüdür; Bu dirilik bulağı?* N.Rəfibəyli.

**ŞƏFAVERİCİ** *sif.* Şəfa verən, şəfalı, sağaldan, sağaldıcı. *Şəfaverici dağ havası. Şəfaverici mədən suları.*

**ŞƏFƏQ** *is.* [*ər.*] 1. Gün çıxmadan və ya batarkən göydə görünən qızartı. *Od tutub qırmızı atəşlə yenə yandı üfüq; Şəfəqin qırmızı rəngilə işıqlandı üfüq*. A.Səhhət.

2. *məc.* Parıltı, bərq, şölə. [Qadın] *üzərinə o qədər daş-qaş tökmüşdü ki, güzgünün qabağında durduğu zaman özünün belə şəfəqdən gözləri qamaşırdı.* M.S.Ordubadi. [Hacı Murad:] *...Almazların şəfəqi gözlərimi qamaşdırır.* S.S.Axundov. ☐ **Şəfəq vermək (salmaq, saçmaq)** – parıldamaq, bərq vurmaq, işıq saçmaq, şölələnmək. *Burdan bir atlı getdi; Atın oynatdı, getdi; Gün kimi şəfəq saldı; Ay kimi batdı, getdi*. (Bayatı). *Buludlar dağlara yavıqlaşdıqca kənarları ağarıb gümüş kimi şəfəq verirdi*. Çəmənzəminli.

**ŞƏFƏQQƏT** bax **şəfqət**. *Madərləriniz etdi sizə mehrü məhəbbət; Ağuşi-şəfəqqətdə sizi bəslədi rahət.* M.Ə.Sabir. [Xarrat:] *Məncə bütün məxluq .. mümkün olan şəfəqqət və himayeyi-insaniyyətdən məhrum qalmamalıdır.* T.Ş.Simurq

**ŞƏFƏQLƏNDİRMƏ** "Şəfəqləndirmək"dən *f.is.*

**ŞƏFƏQLƏNDİRMƏK** *f.* İşıqlandırmaq, şöləndirmək. *..Axşamdan yanan çırağın saralmış alovu birdən titrəyib uzandı, yuxarıya doğru qanad çalıb bir an ətrafı daha artıq şəfəqləndirdi*. Ə.Məmmədxanlı.

**ŞƏFƏQLƏNMƏ** "Şəfəqlənmək"dən *f.is.*

**ŞƏFƏQLƏNMƏK** *f.* İşıqlanmaq, şölələnmək, parıldamaq, şəfəq saçmaq, bərq vurmaq. *Günəşin işığından şəfəqlənən qılınclar qırx min ildırımın birdən şığıdığını andırdı.* M.S.Ordubadi. *Sırğa taxıb qulağına göy otlar da şəfəqləndi; Yuvalardan çıxan quşlar süzüb keçdi bütün kəndi.* B.Vahabzadə.

**ŞƏFƏQLİ** *sif.* Şəfəqsaçan, parlayan, işıqsaçan, bərq vuran, şöləsaçan. *Şəfəqli almaz. Şəfəqli çilçıraq*. – [Rüstəm bəy:] .. *Pürqiymət daşlar cərgəsində* [almaz] *ən gözəl şəfəqli və kimya aləmində bundan bərk və səxt daş hələ bu vəqtə tək dünyada tapılmayıb*. C.Məmmədquluzadə. *Hər tərəfi nə səhərin şəfəqli, nə də axşamın munis toranlığına bənzəməyən xoşagəlməz bir qaranlıq bürümüşdü*. M.Rzaquluzadə.

**ŞƏFFAF** *sif.* [*ər.*] Baxdıqda o biri tərəfi görünən, işığı asanlıqla buraxan, içindən keçirən. *Şəffaf şüşə. Şəffaf cisim.* // *məc.* Aydın, tərtəmiz, dumduru. *Şəffaf göy. Şəffaf su. – O yerdə kim, göyün üzü şəffafdır; Çeşmələri qayət sərindir, safdır.* A.Səhhət. *Yuyundun, darandın, qarlar kimi saf; Tellərin sığallı, gözlərin şəffaf.* Ə.Cavad. *Qış gecəsinin şəffaf havasında mayakın işığı çox yaxşı görünürdü*. M.Rzaquluzadə.

**ŞƏFFAFLAŞDIRMA** "Şəffaflaşdırmaq"-dan *f.is.*

**ŞƏFFAFLAŞDIRMAQ** *f.* Şəffaf hala salmaq.

**ŞƏFFAFLAŞMA** "Şəffaflaşmaq"dan *f.is.*

**ŞƏFFAFLAŞMAQ** *f.* Şəffaf olmaq, açılmaq, aydınlaşmaq, aydın görünmək.

**ŞƏFFAFLIQ** *is.* Duruluq, təmizlik, aydınlıq; şəffaf şeyin halı. *Suyun şəffaflığından çayın dibi görünür*. // Məc. mənada. *Sonatada musiqinin şəffaflığı, formanın aydınlığı nəzəri cəlb edir.*

**ŞƏFİQ** *is.* [*ər.*] *klas.* Şəfqətli, mərhəmətli, ürəyinazik. *Fəğan ki, tez yetir əncamə, dustlər, şəbi-vəsl; Rəfiq çox ki, şəfiq oldu, yol iraq gərək.* Q.Təbrizi.

**ŞƏFQƏT** *is.* [*ər.*] Rəhm, mərhəmət, acıma, yazığı gəlmə, ürəyi yanma, riqqət. [Hatəmxan ağa:] *Sənə lazım olan ərəb, fars, türki, rus dilləridir ki, Allaha şükür, dövləti-əmniyyəmizin şəfqətindən açılan mədrəsələrdə hamısını*

*oxuyub öyrənibsən*. M.F.Axundzadə. [Zeynəbin] *kişilərə qarşı olan nifrəti azalır, qəlbində mərhəmət və şəfqət hissi oyanırdı*. Qantəmir. // Ananın övladına olan məhəbbəti kimi ürəkdən gələn dərin məhəbbət. *Ana şəfqəti. – Ana! Sənin tükənməz əməyin, oxşayıcı şəfqətin, bəsləyici məhəbbətin, qəlb ülviyyətin kimə məlum deyil*. Mir Cəlal.

◊ **Şəfqət bacısı** – xəstəxanalarda: orta tibb təhsili olan tibb işçisi (qadın-qız). *Şəfqət bacısı özünü saxlaya bilməyib ağlamağa başladı*. Ə.Vəliyev. *Dəstədə on nəfər əla nişançı, iki də şəfqət bacısı vardı*. M.Hüseyn.

**ŞƏFQƏTLİ** *sif.* Mərhəmətli, riqqətli, mehriban, şəfqəti olan. *Qadın! Ey sevgilim, şəfqətli mələk! Bu qədər səbrü təhəmmül nə deməк?* H.Cavid. *Zeynal indi öz evinə qayıtmaq, ailəsinin şəfqətli qanadları altına sığınıb, qənaətkar bir zəhmətkeş həyatı yapmaq istəyirdi*. S.Hüseyn. *Kamal anasının şəfqətli gözlərinə, mehriban üzünə baxıb dinmirdi*. M.Rzaquluzadə.

**ŞƏFQƏTSİZ** *sif.* Rəhmsiz, mərhəmətsiz, amansız, daşürəkli. *Şəfqətsiz adam*.

**ŞƏFQƏTSİZCƏSİNƏ** *zərf* İnsafsızcasına, rəhmsizcəsinə, amansızcasına, qəddarcasına.

**ŞƏFQƏTSİZLİK** *is.* Rəhmsizlik, mərhəmətsizlik, insafsızlıq, amansızlıq, qəddarlıq.

**ŞƏHAB** [*ər.* şihab] *klas.* Alov, şölə, şərarə, qığılcım; ildırım. *Düşdü şəhablar, ildırımlar, odlar*. A.Səhhət. *Firuzun parlaq qılıncı havanı bir şəhab kimi yarır*. H.Nəzərli.

**ŞƏHADƏT** *is.* [*ər.*] 1. Şahidlik. [Ağa Salman:] *..Gedim, sərbazları görüm, əhvalat xəbər alım ki, mürafiə vaxtında şəhadətlərini əda etsinlər*. M.F.Axundzadə. // Dəlalət, sübut. *Xəlqə şərh etmək qəmi-hicrin nə hacətdir mənə; Laləvəş sinəmdəki dağlar şəhadətdir mənə*. Q.Zakir. □ **Şəhadət etmək** – 1) b a x **şəhadət vermək**; 2) göstərmək, sübut etmək, dəlalət etmək, təsdiq etmək. *Şagirdin cavabları onun zəkalı olmasına şəhadət edir*. **Şəhadət vermək** – şahidlik etmək, şahidlik göstərmək, gözü ilə gördüyü bir işin həqiqətən olduğunu təsdiq etmək. [Axund Çimnaza:] *Yaxşı, sən öz qızın üçün şəhadət edirsən ki, Səriyyə Qurbana getməyə razıdır?* C.Cabbarlı. *Oğrular üzə çıxdılar. Amma onlar kor Hümmətin tapşırığı ilə İskəndərin əleyhinə şəhadət verdilər*. M.Hüseyn.

2. Şəhidlik, şəhid olma (b a x **şəhid**). □ **Şəhadətə yetişmək** – şəhid olmaq, həlak olmaq (yüksək bir amal yolunda). [Şeyx Nəsrulla qəbiristanlığı göstərib:] *Ondan ötrü ki,* [bunlar xudavəndi-aləmin] *göndərdiyi bəladan qaçmayıb şəhadətə yetişiblər*. C.Məmmədquluzadə.

◊ **Şəhadət barmağı** – baş barmaqla orta barmaq arasındakı barmaq (bir şeyi göstərmək istəyəndə bu barmaqla göstərilir). *Kərbəlayı Heydər əmi çıxardı küçəyə, sağ əlinin şəhadət barmağını yuxarı qovzuyub, ancaq mənə bircə bunu deyərdi ki:* "*Qırışmal! Uşağı döymə!*" C.Məmmədquluzadə. *Kərbəlayı Xəlil şəhadət barmağını əvvəlcə alnına tərəf uzadıb, sonra üst dodağı qarşısında saxladı*. T.Ş.Simurq.

**ŞƏHADƏTNAMƏ** *is.* [*ər.* şəhadət və *fars.* ...namə] Bir şeyi təsdiq edən, bir şeyə icazə verən sənəd, rəsmi kağız; vəsiqə. *Realni məktəbin birinci sinfinə 11-12 yaşından yuxarı şagirdlər qəbul edilməyirdi, buna görə də yaş göstərən təvəllüd şəhadətnaməsi tələb olunurdu*. T.Ş.Simurq.

**ŞƏHD** *is.* [*ər.*] Şan balı, bal, şirə. *Üst-üstə yığılan pətəklərdən və bağçada qoyulan qırmızırəngli yeşiklərdən arılar dəstə-dəstə çıxır, dərələrə yayılır, şəhd toplayır və qayıdırdılar*. S.Rəhimov.

**ŞƏHƏR** *is.* [*fars.*] İnzibati idarələr, sənaye, ticarət və mədəniyyət mərkəzi olan böyük yaşayış məntəqəsi. *Sənaye şəhəri. Böyük şəhər. – ..Bir saata yavıq* [Məhəmməd Həsən əmi] *şəhəri o üzə-bu üzə dolandı ki, bəlkə Xudayar bəyi tapa*. C.Məmmədquluzadə.

**ŞƏHƏRBƏŞƏHƏR** *zərf* Bir-bir şəhərləri gəzərək, bir şəhərdən digərinə, şəhər-şəhər. *Şəhərbəşəhər gəzmək. Şəhərbəşəhər axtarmaq*. – [İranlı:] *Mən sənin sorağını kəndbəkənd, şəhərbəşəhər alıb, gəlib burada tapmışam*. Ə.Haqverdiyev. *Gəzirəm kəndbəkənd, şəhərbəşəhər; Gəlir qulağıma şirin nəğmələr*. M.Rahim.

**ŞƏHƏRCİK** *is.* 1. Balaca şəhər.

2. Hər hansı bir məqsədə xidmət edən yaşayış və ya müəssisə binaları qrupu. *Fəhlə şəhərciyi. Akademiya şəhərciyi. Universitet şəhərciyi*.

**ŞƏHƏRƏTRAFI** *sif.* Şəhərə yapışıq olan, şəhərin ətrafında, kənarında olan. *Şəhərətrafi*

*bağlar. Şəhərətrafı dəmir yolu. – Bakıda və rayonlarda idarələrin çoxu şəhərətrafı təsərrüfat ilə məşğul olur*. M.İbrahimov.

**ŞƏHƏRKƏNARI** b a x **şəhərətrafı**.

**ŞƏHƏR(LƏR)ARASI** *sif.* Şəhərlər arasında olan, işləyən. *Şəhərlərarası telefon stansiyası. Şəhərlərarası avtobuslar işləyir.*

**ŞƏHƏRLİ** *sif.* Şəhər əhli, şəhərdə yaşayan. *Şəhərli qız. – Səlim .. yağışa düşmüş bir şəhərliyə bələdçilik etdiyini danışdı.* Mir Cəlal. *Gözəl sürü idi, – deyə, şəhərli islığı kəsərək bayaqkı sözlərini təkrar etdi*. İ.Əfəndiyev.

**ŞƏHƏRSALMA** *is.* Şəhər bina etmə, şəhər yaratma.

**ŞƏHƏRSAYAĞI** *sif.* və *zərf* Şəhər qaydasında, şəhərdəki kimi. *Şəhərsayağı geyinmək. – Qərənfil bacının əynində indi yaşıl parçadan şəhərsayağı tikilmiş tuman-kofta var idi.* İ.Əfəndiyev.

**ŞƏHƏRTİPLİ** *sif.* Şəhərə oxşar, şəhər kimi, şəhərdəki kimi. *Şəhərtipli qəsəbə. Şəhərtipli xəstəxana. Şəhərtipli yaşayış məntəqələri.*

**ŞƏHƏRYANI** b a x **şəhərətrafı**.

**ŞƏHİD** *is.* [*ər.*] Yüksək amal, məslək, əqidə yolunda ölən, həlak olan, canını fəda edən adam. *Bu təmənnadəyəm, ey gül, ki, şəhidin mən olam; Ölərəm, qeyrini gər mən bu təmənnadə görəm.* S.Ə.Şirvani. *Vətənin yolunda ölən şəhidlər; Ölmür, qovuşurlar əbədiyyətə...* B.Vahabzadə. ☐ **Şəhid olmaq** – yüksək amal, əqidə, məslək yolunda canını fəda etmək, həlak olmaq, ölmək. *Şəhid olmaq fəqət hürriyyət uğrunda səadətdir; Əsarətlə həyatın bisəmər zövqü səfasından.* Ə.Vahid.

**ŞƏHLA** *sif.* [*ər.*] İri tünd-mavi. *Şəhla gözlərində səadət gülər; Sanki hər afətdən pərəstiş dilər; Sənin Məcnunların Leylanı neylər?* H.Cavid. *..Tamam mənə təsəlli verərək sakit edirdisə də .. yaş ilə dolmuş şəhla gözlərindən məlum olurdu ki, bu ayrılıq ona da böyük təsir edir*. S.S.Axundov.

**ŞƏHLAGÖZ(LÜ)** *sif.* Gözləri tünd-mavi olan. *O şəhlagöz, xumargöz; Yar ağyarə yumar göz; Bir qəlbim var, verirəm; Canımı da umar göz*. (Bayatı).

**ŞƏHLALANMA** "Şəhlalanmaq"dan *f.is.*

**ŞƏHLALANMAQ** *f.* İri açılmaq (gözlər haqqında). *Ala gözlər nərgisi-məstanə tək şəhlalanır; Elə ki süzgünləşir, yüz mərtəbə zibalanır.* M.P.Vaqif.

**ŞƏHRƏ** *is.* Açıq yara.

**ŞƏHRİYAR** *is.* [*fars.*] *klas.* Hökmdar, padşah, şah. *Maral isə, ahu isə bu şikar; Belə seyd olur layiqi-şəhriyar.* M.Ə.Sabir. *O söylədi: – Yaşasın şəhriyari-hürriyyət*. B.Vahabzadə.

**ŞƏHRİYARLIQ** *is. köhn.* Şahlıq, xanlıq. [Elxan:] *İki addımlığında Şirvan şəhriyarlığı da* [ərəb xilafətinə] *qarşı vuruşur.* C.Cabbarlı.

**ŞƏHVANİ** *sif.* [*ər.*] Şəhvətə, cinsi əlaqəyə aid. *Şəhvani hisslər*.

**ŞƏHVƏT** *is.* [*ər.*] Şəhvani ehtiras, cinsi əlaqə meyli. *Toğrulun xanəndələri hökmdarın şəhvət və nəşəsini coşdura biləcək təzə qəzəl və rübailər öyrənirdilər.* M.S.Ordubadi. *Şəhvət hissi Fərhadın ürəyində bir dərəcəyə çatdı ki, tamam dərs, məktəb nəzərindən qeyb oldu.* C.Cabbarlı.

**ŞƏHVƏTKAR** *sif.* [*ər.*] Şəhvət və *fars.* ...kar] b a x **şəhvətpərəst**.

**ŞƏHVƏTLİ** *sif.* Şəhvətlə dolu, şəhvət ifadə edən, ehtiraslı. *Şəhvətli gözlər. – Yüksəldi hər tərəfdən; Şəhvətli, kirli səslər; Alınlarda dolandı; Ölüm iyli nəfəslər.* Ə.Cavad.

**ŞƏHVƏTPƏRƏST** *sif.* [*ər.* şəhvət və *fars.* ...pərəst] Şəhvət düşkünü. *O, bu qədər şəhvətpərəst və kənizpərəst xəlifənin paytaxtından qızları nə cürə qurtara biləcəyi barəsində düşünürdü*. M.S.Ordubadi.

**ŞƏHVƏTPƏRƏSTLİK** *is.* Şəhvət düşkünlüyü.

**ŞƏXS** *is.* [*ər.*] Cəmiyyətdə ayrıca adam; fərd, kimsə. *Hər bir şəxs. Bir şəxs sizi görmək istəyir. – Vətəni sevməyən insan olmaz; Olsa, ol şəxsdə vicdan olmaz.* A.Səhhət. *Aslan mərhəmətli və əxlaqı düzgün bir şəxs idi.* C.Cabbarlı.

**ŞƏXSƏN** *zərf* [*ər.*] Arada heç bir şəxs iştirak etmədən, heç bir vasitə olmadan, bilavasitə özü (özünü). *Bu adamı şəxsən tanıyıram. – Keçmiş zaman şəxsən* [Mirzağanın] *özü üçün qaranlıq idi*. S.Hüseyn. *İmran kişi şəxsən* [Tahirin] *nə ilə məşğul olduğunu xəbər aldı*. M.Hüseyn. *Gəldiyevi belə bir tədbirə vadar eləyən o idi ki, şəxsən özü layihə düzəltmək niyyətində idi.* Mir Cəlal. // Bilavasitə. *Məktub şəxsən ona aiddir. Məsələni şəxsən özünə bildirin.*

**ŞƏXSİ** *sif.* [*ər.*] Bir şəxsə, adama məxsus (aid) olan, şəxsən onun özü üçün olan, özünün. *Budur, bu məclisə yığışanların hamısı öz şəxsi həyatlarını, hörmətlərini təhlükə altına salaraq gəlmişlər.* S.Rəhman. // Bir şəxsin özünə məxsus olan, onun istifadəsində olan; xüsusi. *Şəxsi mülk. Şəxsi maşın.* // Ayrıca bir şəxsə aid olan, ancaq ona xidmət edən. *Şəxsi katib. Şəxsi mühafizə dəstəsi.* // Müəyyən şəxsə xas olan. *Şəxsi fikir. Şəxsi rəy. Şəxsi təcrübə.* // Bir şəxsin xüsusi ailə həyatına, ailə münasibətlərinə aid olan. *Başqalarının şəxsi həyatına qarışmaq. Şəxsi həyatları yaxşı deyil.* // Şəxsiyyətə aid. *Vətəndaşların şəxsi hüquqları. Şəxsi toxunulmazlıq. Şəxsi vəsiqə.* // Müəyyən şəxsə yönəldilmiş, ona toxunan. *Şəxsi təhqir. Mən bunu özümə şəxsi həqarət sayıram.*

◊ **Şəxsi heyət** – hər hansı bir idarədə, müəssisədə, hərbi hissədə və s.-də xidmət edən şəxslərin heyəti. **Şəxsi iş** – bir idarədə, müəssisədə, hərbi hissədə xidmət edən və ya bir yerdə oxuyan şəxsə aid sənədlərin məcmusu.

**ŞƏXSİ-QƏRƏZ** *is.* [*ər.*] Gizli ədavət, gizli düşmənçilik, gizli niyyət, məqsəd, qərəz. *Siz bu xəbərin şəxsi-qərəzdən doğmadığını haradan bilirsiniz?* M.S.Ordubadi. *Zeynal .. şöbə müdirinin özü ilə şəxsi-qərəzi olduğundan .. şikayət edirdi.* S.Hüseyn. [Səməd:] *Yoldaş sədr, bu kişi yalan danışır. Üstümə ləkə atır. Mənimlə şəxsi-qərəzi var.* B.Talıblı.

**ŞƏXSİ-QƏRƏZLİK** *is.* Birilə şəxsi ədavəti, qərəzi olma; şəxsi ədavət, qərəz. *..Şəxsi-qərəzlik üzündən haqqı inkar etmək kişilikdən deyildir.* M.F.Axundzadə. [Barat:] *Mən ancaq onu deyə bilərəm ki, bunların hamısı şəxsi-qərəzlikdir. Bizim kəndimizə* [Almaz] *kimi işləyən müəllimə gəlməmişdir.* C.Cabbarlı. *..Nəticədə yazılanların şəxsi-qərəzlik və böhtan olduğu aydın edilir.* S.Rəhman.

**ŞƏXSİYYƏT** *is.* [*ər.*] 1. Bir şəxsə xas olub onun fərdiyyətini müəyyən edən xüsusiyyətlərin məcmusu. *Alarsa hər gecə üç-dörd nəfər əşxas gər vədim; Nə qəm, beş-altı da olsa, mənim şəxsiyyətim artır.* M.Ə.Sabir.

2. Öz xarakteri, əxlaqı, cəmiyyətdə mövqeyi və s. baxımından insan, şəxs, sima. *Böyük şəxsiyyət. Görkəmli şəxsiyyət. Tanınmış şəxsiyyətlər.* – [Qadın:] *Şairlər nə qədər həssas şəxsiyyət imiş.* M.S.Ordubadi. *Mollayev öz əcəli ilə ölmüş görkəmli şəxsiyyətlərdən də əl çəkmirdi.* M.Hüseyn.

**ŞƏXSİYYƏTSİZ** *sif.* Şəxsiyyəti, mənliyi, siması olmayan; simasız, mənliksiz. [Qədim Romada] *arvad şəxsiyyətsiz bir parça şey hesab olunurdu, ona görə də özünə məxsus mal və sərvəti ola bilməzdi.* Çəmənzəminli.

**ŞƏXSİYYƏTSİZLİK** *is.* Şəxsiyyəti, siması, mənliyi olmama; simasızlıq; mənliksizlik.

**ŞƏXSLİ** *sif. qram.* Şəxs qrammatik kateqoriyasını bildirən. *Şəxsli cümlə.*

**ŞƏXSSİZ** *sif. qram.* Mübtədası olmayan və təsəvvür olunmayan. *Şəxssiz cümlə.*

**ŞƏKƏR** *is.* [*fars.*] 1. Qənd. *Xalq batıbdır noğla, şəkərə, qəndə; Bizim evdə axta zoğal da yoxdur.* M.P.Vaqif. // *məc.* Şirin, dadlı, ləzzətli şey mənasında. *Danışanda şəkər damar sözündən; Qaymaq dodaqları ballı sənəm, gəl!* Xəstə Qasım.

2. *tib.* Şəkər xəstəliyi, diabet. *Şəkəri olan adam ciddi pəhriz gözləməlidir. – Eşitdim; top gurultusu eşidən kimi: – Şəkər! Gözlərimi həkimin gözündən çəkmədim.* R.Rza.

**ŞƏKƏRARMUDU** *is.* Sarı rəngli, çox şirin armud növü.

**ŞƏKƏRBAĞI** *is.* Tumana, şalvara və s.-yə salınan uzun qaytan.

**ŞƏKƏRBURA** *is.* İçərisi şəkər tozu ilə qoz, fındıq və ya badam ləpəsi qatışıq içlə doldurulmuş, kənarları vintvari burulmuş və üstü naxışlı şirniyyat növü. *Bir sininin kənarında; Yaxılırdı iki-üç şam; Qarşımızda şəkərbura; Noğul-nabat, püstə-badam.* M.Müşfiq. *Tabaq-tabaq paxlava, şəkərbura, nabat, qənd; Xonçaların bəzəyi bənd etmişdi məni, bənd.* X.Rza.

**ŞƏKƏRÇÖRƏYİ** *is.* Şəkər, yağ, un və s.-dən bişirilən şirin qoğal növü. [Xonça] *ibarətdir yağlı şəkər bişmişlərdən – şəkərburadan, şəkərçörəyindən, ovma fətirdən və s. həlviyyatdan.* R.Əfəndiyev. [Səriyyə:] *Stolun üzərinə ağ süfrə saldım. Şəkərçörəyi, konfet qoydum.* İ.Əfəndiyev.

**ŞƏKƏRİ** b a x **şəkərarmudu**.

**ŞƏKƏRLƏMƏ** 1. "Şəkərləmək"dən *f.is.*

2. Şəkər şirəsində qaynadılıb xarlanmış meyvə. *Məhərrəm əmi çox oturmadı, şəkər-*

*ləmə ilə bir fincan südlü qəhvə içdikdən sonra getdi.* A.Şaiq.

**ŞƏKƏRLƏMƏK** *f.* Şəkər səpmək, şəkər qarışdırmaq, yaxud şəkər şirəsində qaynatmaq. *Meyvəni şəkərləmək.*

**ŞƏKƏRLƏNMƏ** "Şəkərlənmək"dən *f.is.*

**ŞƏKƏRLƏNMƏK** *f.* Şəkər təbəqəsi ilə örtülmək, xarlanmaq.

**ŞƏKƏRLİ** *sif.* Şəkər (qənd) qatılmış, tərkibində şəkər olan; şirin. *Şəkərli qoğal.*

**ŞƏKİL** *is.* [*ər.*] 1. Bir şeyin, ya adamın xarici görünüşü; sifət, surət. *Uşaq böyüdükcə şəklini dəyişirdi. – Vidadi xəstəni gəl indi tanı; hanı o sən görən şəklü nişanı.* M.V.Vidadi. ◻ **Şəkli düşmək** – hamar, parlaq səth üzərində surəti, əksi düşmək (görünmək). *Suya ağacların şəkli düşmüşdür.*

2. Bir şeyin və ya şəxsin əl və ya foto ilə çəkilmiş surəti; tablo, rəsm. *Əsgər şəkli. Divardan böyük bir şəkil asılmışdı.* – [Qulu:] *Özgələrin evinə gedirsən – bir küncdə divan, bir yanda stullar və stollar, divarlarda xalılar və şəkillər asılıb.* N.Nərimanov. *Novruzun qəzetdə çıxmış şəkli əldən-ələ dolaşır, onun adı dillərdə əzbər olurdu.* S.Rəhman. ◻ **Şəkil çəkmək** – 1) rəsm çəkmək; 2) fotosurətini çıxarmaq. **Şəklini çəkdirmək** – fotoqrafiya üsulu ilə öz əksini çıxartdırmaq. // Surət, obraz, təsvir, bənzər, timsal. *Onun şəkli indi də gözümün qabağından getmir.*

3. *məc.* Öz xarici gözəlliyi, bədiiliyi ilə adamı heyran edən şey haqqında. *İnsan deyil, bir şəkildir.* ◻ **Şəkil kimi** – gözəl, göyçək qəşəng (adam haqqında). [Gülgəz:] *Mənim oğlum Bakı kimi yerdə oxuyur. Şəkil kimi oğlandır.* İ.Əfəndiyev.

4. Dram əsərlərində ayrıca dekorasiya tələb edən pərdənin bir hissəsi. "Vaqif" *pyesi 5 pərdə 11 şəkildir. – Kinostudiya bir şəklin ayrı-ayrı hissələrini çəkmək üçün ekspedisiyaya hazırlaşırdı.* İ.Əfəndiyev.

5. *məc.* Mənzərə, təsəvvür olunan şey. *Gələcək şəhərin şəklini göz qabağına gətirmək. Qürubun valehedici şəklinə tamaşa etmək.*

6. Kinofilm. *Dünən klubda maraqlı bir şəkil göstərdilər.*

7. Vəziyyət, hal, forma, xarakter. *İlyasın söhbəti çox ciddi şəkil aldı.* M.S.Ordubadi. ◻ **Şəklə düşmək (girmək)** – bu və ya başqa bir şəkil almaq, dona girmək, şəklini dəyişmək. *Bu halda bir qoca ağsaqqal kişi əlində ağac və bir neçə jandarm daxil olurlar. Onlardan biri deyir:* "*Qanun hökmünə görə dustaq edərəm sizi*". *Laçın bəy, Cahangir bəy, Qulu bəy hərəsi bir şəklə düşür.* N.Vəzirov.

**ŞƏKİLCƏ** *zərf* Formaca, forma cəhətdən. [Nizami Fəxrəddinə:] *Tovus quşunun tərbiyəsi və onun vücudunun istiliyi ilə yumurtadan çıxan qarğanın cücəsi şəkilcə qarğa olsa belə, ədəb və tərbiyə cəhətcə tovus quşunun yolunu təqib edər.* M.S.Ordubadi.

**ŞƏKİLÇƏKƏN** *dan.* b a x **fotoqraf**.

**ŞƏKİLÇİ** *is. qram.* Sözün ayrılıqda işlənməyən, müstəqil mənaya malik olmayan və söz köklərinə bitişdikdə onların ya şəklini, ya da şəkli ilə birlikdə məzmununu dəyişən qismi. *Sözdüzəldici şəkilçi. Sözdəyişdirici şəkilçi.*

**ŞƏKİLÇİLƏŞMƏ** "Şəkilçiləşmək"dən *f.is.*

**ŞƏKİLÇİLƏŞMƏK** *f. qram.* Şəkilçi şəklini almaq, dönüb şəkilçi olmaq.

**ŞƏKİLDƏN-ŞƏKLƏ** *zərf* Bir haldan (vəziyyətdən, formadan) başqa hala (vəziyyətə, formaya). *Ağız-burnunu şəkildən-şəklə salır.*

**ŞƏKİLDƏYİŞMƏ** *is.* Bir şəkildən başqa şəklə düşmə, zahiri görünüşünü dəyişmə.

**ŞƏKİLLİ** *sif.* 1. İçində şəkillər olan; rəsmli. *Şəkilli jurnal. Şəkilli məcmuə. – Qonça şəkilli kitabı istəyir, Aqil vermir, bacısına gözlərini ağardırdı.* Ə.Vəliyev.

2. *məc.* Gözəl, göyçək, qəşəng, gözə xoşgələn, gözəşirin. *Yaylığı kirli balam; Qəlbi fikirli balam; Cahıl-cuhul içində; Mənim şəkilli balam.* (Bayatı). *Biri sərtasər ağ, həm siyah telli; Biri buğdayıdır, alma şəkilli.* M.P.Vaqif. [Nəcibə] *alagöz, ağbəniz, qırmızıyanaq, qara şəvəsaç, ucaboy, şəkilli .. ceyran kimi bir qızdır.* Mir Cəlal.

3. Adətən rəqəmlərlə – səhnədə və ya kinoda göstərilən əsərin neçə şəkildən ibarət olduğunu bildirir. *10 şəkilli əsər. – Səməd Vurğun şerinin yüksək inkişaf nümunəsi, şübhəsiz ki, şairin 1938-ci ildə yazdığı on bir şəkilli* "*Vaqif*" *adlı dramatik poemasıdır.* M.Arif.

**ŞƏKİLPƏRƏST** *sif.* [*ər.* şəkil və *fars.* ...pərəst] b a x **surətpərəst**. [Qətibə:] [Kişilər] *qadının qəlbi ilə yox, şəkli ilə maraqlanırlar, ümumiyyətlə, onlar şəkilpərəstdirlər. Gözəlliyi, hətta boyalı gözəlliyi sevirlər.* M.S.Ordubadi.

**ŞƏKİLSİZ** *sif.* 1. Şəkli, rəsmləri olmayan; rəsmsiz. *Şəkilsiz jurnal.*

2. *məc.* Biçimsiz, görünüşsüz, görünüşcə nəzəri cəlb etməyən.

**ŞƏKİL-ŞƏMAYİL** b a x **şir-şəkil**. *Münəvvər xanımın şəkli-şəmayili Hacını lap əvvəl gündən cəlb eləmişdi.* Mir Cəlal.

**ŞƏKK** *is.* [*ər.*] Bir şeyin gerçəkliyinə, doğruluğuna şübhə etmə; şübhə, güman, zənn. *Leyli dedi: – Çün sənə şəkkim var; Məcnun isən, eylə halın izhar.* Füzuli. *Əziz balalar!.. Sizin bizdən xoşbəxt olmağınıza heç şəkk yoxdur.* N.Nərimanov. [Hacı Osman:] *Vəli kişinin qoçaq olmasına şəkkin yoxdur ki, Cavad bəy?* N.Vəzirov. ◻ **Şəkdən çıxartmaq** – inandırmaq, şübhə üçün arada yer qoymamaq, şəkk-şübhədən qurtarmaq, inandırmaq. [Seyid Əhməd Seyid Səmədə:] *Andına inanıram. Amma gərək bir şeyə də and içib, məni dürüst şəkdən çıxarasan.* Ə.Haqverdiyev. **Şəkdən çıxmaq** – b a x **şəkk-şübhədən çıxmaq**. **Şəkkə düşmək** – özündə şübhə doğmaq, şübhə eləmək, şübhə altına almaq. [Dərviş] *mənim şəkkə düşməmi anladı.* A.Divanbəyoğlu. *Mətbəxdəki arvadlar qara çadraya bürünmüş qadını gördükdə, şəkkə düşmüş və cürbəcür fikirlər irəli sürməyə başlamışdılar.* T.Ş.Simurq. **Şəkk eləmək (etmək)** – bir işin doğruluğuna, həqiqiliyinə, gerçəkliyinə inanmamaq, şübhə etmək. [Səməd kişi:] *Xeyr, xeyr, əstəğfürullah elə, Allahın hünərinə şəkk eləmə.* T.Ş.Simurq. *Bu elə hikmətli çarə idi ki, şəkk eləməyə heç kəsin cürəti çatmırdı.* S.Rəhman. **Şəkk gətirmək** – b a x **şəkkə düşmək**. *Sən mənim sözümə heç gətirmə şəkk; Bizim evlərdə də gəl görün tək-tək.* M.P.Vaqif. [Qəhrəman:] *Rəhmətliyin qızı, sən də şəkk gətirirsən?* S.Rəhimov.

**ŞƏKKAK** *sif.* və *is.* [*ər.*] Hər şeyə şübhə edən, şübhə ilə baxan, heç şeyə inanmayan, şəkli. [Molla Kərim:] *Dünyanın axırıdır. Şəkkakə lənət, – deyə dışarı sıçradı.* B.Talıblı. [Nəcəfalı:] *Şəkkakdır o, şəkkak. Heç şeyə inanmır.* B.Bayramov. *Belə olan təqdirdə o şəkkakları necə qandırasan ki, siz hələ birini görmüsünüz...* S.Qədirzadə.

**ŞƏKKAKLIQ** *is.* Hər şeyə şəkk-şübhə etmə, şəkk-şübhə ilə baxma.

**ŞƏKK-ŞÜBHƏ** *is.* [*ər.*] İnamsızlıq, inanmama, bədgümanlıq; şəkk, şübhə. *Bu işin şəkk-şübhəsi yoxdur. Şəkk-şübhədən qurtarmaq.* – [Bənna:] *Rəhmətlik öləndən sonra uşaqları .. bircə otağın divarından iki sandıqça qızıl tapıblar. Yaxşı axtarsalar, milyona şəkkim-şübhəm yoxdur.* M.Hüseyn. ◻ **Şəkk-şübhədən çıxartmaq** – şübhədən qurtarmaq. [Məşədi İbad:] *Bağışla, bəy, Allah səndən razı olsun ki, bizi şəkk-şübhədən çıxartdın.* Ü.Hacıbəyov.

**ŞƏKK-ŞÜBHƏSİZ** *zərf* və *sif.* Heç bir şəkk, şübhə olmadan, yəqin, sözsüz, gerçək. *Şəkk-şübhəsiz bu iş yerinə yetiriləcəkdir.* – [Seyrəksaç dəllək:] *Birisi bu dünyada günahsız yerə bir qarışqanı tapdayıb öldürmüş olsa, orada şəkk-şübhəsiz sorğu-sual olunacaqdır.* S.Rəhimov.

**ŞƏKLƏMƏ** "Şəkləmək"dən *f.is.*

**ŞƏKLƏMƏK**: **qulaqlarını şəkləmək** – b a x **qulaq**. *Birdən atlar səs eşidib qulaqlarını şəklədilər.* T.Ş.Simurq. *Əsgər ağa birdən qulaqlarını şəklədi, ətrafı dinləməyə başladı.* S.Rəhman.

**ŞƏKLƏN** *zərf* [*ər.*] Şəklinə görə, şəkilcə, zahiri görünüşcə. *Şəklən artistə oxşayır.*

**ŞƏKLƏNDİRMƏ** "Şəkləndirmək"dən *f.is.*

**ŞƏKLƏNDİRMƏK** *icb.* Şəkkə salmaq, şübhəyə salmaq, şübhələndirmək.

**ŞƏKLƏNMƏ** "Şəklənmək"dən *f.is.*

**ŞƏKLƏNMƏK** *f.* Şəkkə düşmək, şübhə etmək, şübhələnmək. *Həmin şəxs bir saat bundan qabaq küçədə gəzərkən İslamiyyə mehmanxanasına cəm olan müsəlmanlara diqqət salıb şəklənmişdi ki, bunlar işsiz deyillər.* C.Məmmədquluzadə.

**ŞƏKLƏTMƏ** "Şəklətmək"dən *f.is.*

**ŞƏKLƏTMƏK** *f.* Şəkkə salmaq, şübhəyə salmaq, şübhələndirmək, şübhə oyatmaq. [Əhməd:] *Adamsan, adam oğlusan, beş manat nə puldur ki, sən o yandan bəri şəklədirsən?* N.Vəzirov.

**ŞƏKLİ**[1] *sif.* Şübhəli, şübhə doğuran; inam, etibar doğurmayan. *Şəkli adam. Şəkli iş. Bir-birindən şəkli olmaq.* // *is.* Şəkk edən, şübhə edən; şəkkak.

**ŞƏKLİ**[2] *sif.* [*ər.*] Zahiri görünüşcə (görünüşünə görə), zahirən.

**ŞƏKSİZ** *zərf* Şübhəsiz, yəqin, əlbəttə. [Ağa Səttar:] *Bəli, elə kişidən şəksiz saleh övlad qalacaqdır*. M.F.Axundzadə. *Qüvvətin varsa, yaşarsan məsud; Yoxsa, şəksiz olacaqsan nabud*. A.Səhhət.

**ŞƏKSİZ-ŞÜBHƏSİZ** bax **şəksiz**. *Səməd bu sözləri özü-özünə söylər və istiqbalının parlaq olacağına şəksiz-şübhəsiz inanardı*. B.Talıblı. *Sənsən bahar, sənsən şəksiz-şübhəsiz; Nəğməmin ahəngi, şerimin rəngi*. S.Rüstəm.

**ŞƏKVA** *is.* [*ər.*] *klas.* Şikayət. ☐ **Şəkva etmək (eyləmək)** – şikayət etmək. *Cənnət həramım olsun, əgər şəkva eyləsəm*. S.Ə.Şirvani. *Usan, etmə şikayət bizdən əsla; Get, öz baxtından eylə indi şəkva*. M.Ə.Sabir.

**ŞƏQAİQ** *is.* [*ər.*] Laləgülü, xoruzgülü, gəlincikgülü. *Şəqaiq, qərənfil, süsən, nəstərən; Zəbani-hal ilə oxur müstəhsən*. Q.Zakir.

**ŞƏLALƏ** *is.* Çay yatağında sıldırım qayadan tökülən güclü su axını; çağlayan, şır-şır. *Qaraca qız iki arşın ucalıqdan tökülən şəlalənin altında durub çimdiyinə görə Yasəmənin səsini eşitmədi*. S.S.Axundov. *Nəbi .. qıjıltı ilə gedən çaylara, qayalardan çağlayıb tökülən şəlalələrə tamaşa edirdi*. S.Rəhimov.

**ŞƏLALƏCİK** *is.* Kiçik şəlalə; süni surətdə düzəldilmiş kiçik şəlalə.

**ŞƏLALƏLİ** *sif.* Şəlaləsi, ya şəlalələri olan. *..Çopur qara qayaların arasından pıqqıldaya-pıqqıldaya dəlicəsinə çıxan şəlaləli çay öz hay-harayı ilə Qarabağ düzənlərinə tərəf gedirdi*. S.Rəhimov. *Şəlaləli qoca Tərtər; Xaçın çayı, dəli Qar-qar*. Aşıq Hüseyn.

**ŞƏLƏ** *is.* Arxada aparıla biləcək qədər bağlanmış yük (şax, odun və s.). *Şələ bağlamaq*. – [Niyaz:] *Sən də ki odunçusan, hər gün gəlib, burada bir şələ odun tapırsan, deyirsən, bəxtim gəlib*. Ə.Haqverdiyev. *Bir gün eşq sevdasından məst olmuş Nadir dalında bir şələ odun gətirdi*. B.Talıblı. [Gülcahan:] *Get, meşənin ətrafından quru odun budaqlarından bir şələ topla gətir*. T.Ş.Simurq.

◊ **Şələni qoy, gəl dalaşaq (döyüşək)** – heç bir səbəb olmadan dalaşmağa can atan adam haqqında. [Kişi:] *Gördüm ki, bu oldu şələni qoy yerə, gəl döyüşək*. "Kirpi". **Şələsini sudan çıxarmaq (çıxara bilmək)** – bax **çulunu sudan çıxarmaq** ("**çul**"da). [Xanpəri:] *Bu gündən sübut edəcəyəm ki, mənim heç kimə minnətim yoxdur. Özüm öz şələmi sudan çıxara bilərəm*. Ə.Vəliyev. **Şələsini tutmaq** – bax **yükünü tutmaq** ("**yük**"də).

**ŞƏLƏKƏT** *sif. məh*. Çox sakit, xay. *Şələkət bir gecə idi*. S.Hüseyn.

**ŞƏLƏ-KÜLƏ** bax **şey-şüy**.

◊ **Şələ-küləsini (şələ-şüləsini) qoltuğuna vermək** – bax **şələ-küləsini bayıra atmaq**. [Gülzar:] *Şələ-küləsini verdim qoltuqlarına, qovdum, getdilər*. İ.Hüseynov. **Şələ-küləsini bayıra atmaq** – şey-şüyünü əlinə verərək qovalamaq; qovmaq. **Şələ-küləsini dalına sarımaq** – bax **şələ-küləsini qoltuğuna vermək**. **Şələ-küləsini yığmaq (yığışdırmaq)** – nəyi varsa özü ilə götürmək. *Molla Nəsrəddin* [Teymurun] *bu xasiyyətini bilən kimi şələ-küləsini yığışdırıb, birbaş qaçır kəndlərinə*. "M.N.lətif." [Ağayev:] *Əgər* [Qurban] *ayağını yerə dirəməsəydi, Qumadadan şələ-küləmizi yığışdırıb çoxdan çıxmışdıq*. M.Süleymanov.

**ŞƏLƏQUYRUQ** *is.* Tülküyə verilən ləqəb. *Bir demədin ki, tülkü; Quyruqsuz neyləsin bəs; Şələquyruq olmasa; Tülkü baba keçinməz*. R.Rza.

**ŞƏLƏLƏMƏ** "Şələləmək"dən *f.is.*

**ŞƏLƏLƏMƏK** *f.* Şələ bağlayıb arxasına götürmək, dalına qoymaq, yükləmək (bəzən "dalına" sözü ilə). [Niyaz:] *A kişi, sarsaq olma, gəl odunu şələlə dalına, itil cəhənnəmə*. Ə.Haqverdiyev. *Arvadlar və iri qızlar bu palçıqdan qazıb, torbalarda dallarına şələlər, satmaq üçün aparardılar*. Ə.Əbülhəsən. *Məsmə, Səkinə, Pəri çəkillikdə ipək qurdu üçün budaq qırır, şələləyərək daşıyırdılar*. Mir Cəlal.

**ŞƏLƏLƏNMƏ** "Şələlənmək"dən *f.is.*

**ŞƏLƏLƏNMƏK** *məch.* Şələ edib dalına götürmək, yüklənmək, dalına yük çatmaq. *Kosa, Mədətin kara gələcəyi qorxusundan Əfruz bacıya təslim olub boyun əydi. O, kisəni şələləndi, toyuqları aldı*. S.Rəhimov.

**ŞƏLƏLİ** *sif.* Dalına şələ götürmüş, yüklənmiş. *Yolla şələli adam gedirdi*.

**ŞƏLƏPAPAQ** *sif.* Başına uzuntüklü dəridən papaq qoymuş. *Şələpapaq kişi. Şələpapaq kəndli*. – [Hüseynqulu:] *Əmim oğlu komandir olduğuna görə rəngi saralmış, əynində*

*dəridən paltar, başında bir şələpapaq sükançının yanında durmuşdu.* H.Sarabski.

**ŞƏLƏ-ŞƏLƏ** *zərf* Şələlərlə, bağlı-bağlı, yığın-yığın. [Ayrım qızı] *meşədən şələ-şələ odun daşıyar, sac asar, nehrə çalxayar və yorulmaq nə olduğunu bilməzdi.* A.Şaiq. [Mücü] *köklərindən hər gün şələ-şələ kəndə daşındı.* R.Rza.

**ŞƏLƏ-ŞİLTƏ** bax **şəlpə-şülpə**. [Qoca:] *Çata bilmərik, yağı xanı, bəyləri də basar alar, şələ-şiltəsini toplar, gedər, bizə ar olar.* M.Rzaquluzadə.

**ŞƏLƏ-ŞÜLƏ** bax **şələ-şiltə**. [Hacı Murad:] *..Get, şələ-şüləni yığışdır.* S.S.Axundov. [Tahir:] *Bilsəm ki, azarım-bezarım yoxdur, o dəqiqə şələ-şüləmi yığıb gedərəm.* M.Hüseyn.

**ŞƏLLƏMƏ** "Şəlləmək"dən *f.is.*

**ŞƏLLƏMƏK** *f.* Dalına almaq, yükləmək. *Ata* [Saranı] *arxasına şəlləyib qoyun otardı.* İ.Əfəndiyev.

**ŞƏLPƏ** bax **şəlpə-şülpə**. *Süzmə dəxi, gözlərin aç, a Babayi-Əmir; Şəlpələrin tez yığıb qaç, a Babayi-Əmir.* C.Cabbarlı.

**ŞƏLPƏ-ŞÜLPƏ** *top. dan.* Pal-paltara, yaxud xırım-xırda şeylərə saymazyana verilən ad.

**ŞƏLTƏ** *is.* 1. Qadın alt tumanı, dizlik.

2. *dan.* Cır-cındır, yıpranmış, üzülmüş, köhnə-kürüş şeylər (xalça, palaz, geyim, parça və s.). *Otaq kasıb döşənmiş, dörd-beş şəltədən ibarət idi.* A.Şaiq.

◊ **Şəltəsi işləməmək (keçməmək)** – kələyi baş tutmamaq, hiyləsi keçməmək. *..Dəni məqsədlilərin burada şəltəsi işləməz. Onlar zərərdən savay heç bir xeyir yetirə bilməzlər.* Ü.Hacıbəyov. *Qarı bu yerdə şəltəsini işlədə bilmədi.* Mir Cəlal.

**ŞƏLTƏLİK** *is.* Şəltəyə (1-ci mənada) yarar parça. // Sif. mənasında. *Şəltəlik parça.*

**ŞƏLTƏ-ŞƏLTƏ** *zərf dan.* Parça-parça, tikə-tikə. [Humayın] *papağına dörd tolamaz birdən dəydiyi üçün papağın sağanağı şəltə-şəltə oldu.* Ə.Vəliyev.

**ŞƏLTƏ-ŞÜLTƏ** *dan.* bax **şəltə**.

**ŞƏM** *klas.* bax **şam**. *Nə xoş olur eşq əhlinin bu halı; Şəmə yanə pərvanənin misalı.* M.V.Vidadi. [Padşahın qızı:] *Çünki atam bilsə* [Rizvanı] *yüz parça elər. Odur ki, danışa bilməyib, gün-gündən şəm tək əriyirəm.* Ə.Haqverdiyev.

**ŞƏMATƏT** *is.* [*ər.*] *klas.* 1. Birinin başına gələn bəla və müsibətdən düşmənin sevinib kam alması; bədxahlıq.

2. Tənə, məzəmmət, danlaq. *Olmayaydım ol pəri eşqində rüsvayi-cəhan; Çəkməyəydim dustü düşməndən şəmatət kaş ki.* S.Ə.Şirvani. *Müftəxorluq nə gözəl peşə idi, tutmuş idim; Nə açan üstünü karın, nə şəmatət var idi.* M.Ə.Sabir. □ **Şəmatət etmək** *klas.* – tənə vurmaq, ayıblamaq, danlamaq, məzəmmətləmək. *Bir qədər* [gəncə] *ağır gəlirdi; İlmək boğaza keçib asılmaq; Təhqir ilə yellənib də qalmaq; Meydanda duran bütün camaət; Hərdən edələr ona şəmatət.* A.Səhhət.

**ŞƏMS** *is.* [*ər.*] Günəş, gün. *O necə quş idi anasını əmər; Havada dövr edər, şəms ilə qəmər?* Xəstə Qasım. *Camalın xəcil elər, Şəms ilə mahı, müxtəsər.* Aşıq Ələsgər.

**ŞƏMSİYYƏ** *is.* [*ər.*] Günlük, çətir, zontik. [Qız] *əda ilə əlindəki ağ və pənbə ipəkli şəmsiyyəsini oynada-oynada hər kəsin önündən sallanaraq keçər*(*di*). A.Şaiq. *Hər tərəfdən ağ geyimli altı qız fironun xanımının başına tavus lələklərindən yapma şəmsiyyələr tutmuşdular.* Çəmənzəminli. *Sona qaranlıq küçədə şəmsiyyəsiz yağışın altında durmuş*(*du*).. Ə.Əbülhəsən.

**ŞƏMŞİR** *is.* [*fars.*] Qılınc. *İş atışmadan ötüb, şəmşir və xəncər ilə bir-birinə həmlə etməyə çatdı.* M.F.Axundzadə. *Yanımda gər dura cəllad əlində şəmşiri; Ölüm gücüylə mənə hökm edə olum təslim; Əyilmərəm yenə haşa.* C.Cabbarlı. □ **Şəmşir çəkmək** *klas.* – qılıncla vuruşmağa hazırlaşmaq, qılınc çəkmək, qılınca əl atmaq. *Şəmşir çəkdi, qətlin üçün gəldi ol pəri; Sandın ki, rəhm edər sənə ol dilruba, könül.* S.Ə.Şirvani.

**ŞƏMŞİRBAZ** *sif.* [*fars.*] Qılıncoynadan. *Görməmişəm, qızdan şəmşirbaz olmaz; Maralım, ceyranım, dönmərəm səndən.* (Qoşma).

**ŞƏMS-QƏMƏR** *is.* [*ər.*] *şair.* Günəş və Ay (Şərq ədəbiyyatında gözəlin camalına təşbeh). *Ey şəms-qəmər yüzlü, şirin dodağın duzlu; Vey şəhdü şəkər sözlü, didarına müştaqəm.* Nəsimi. *Camalındı şəms-qəmər; Dərdin bu sinəmdə dəftər; Ucundan yazıq Ələsgər; Dönübdür abdala, Maral!* Aşıq Ələsgər.

**ŞƏN** *sif.* Sevinc, sevincli, şad, məmnun. [Sevda:] *Güldükcə günəş mən də gülərdim;*

*Şən könlümü azadə dilərdim.* H.Cavid. *Böyük günlər, şanlı günlər, şən günlər; Yoluna düşən günlər; Hələ qarşımızdadır.* M.Müşfiq.

**ŞƏN** b a x **şan**[1]. *Getdi şənimiz, etibarımız; Varmı rütbəmiz, iqtidarımız?* M.Ə.Sabir. [Səfər bəy:] *Xayır, bu heç mənim şənimə yaraşan ad deyil! Qoy desinlər "ət yeyən Səfər bəy", "yağ yeyən Səfər bəy".* B.Talıblı. *Mən sevirəm dövlətimi; Onun şəni böyükdür.* Ə.Cəmil. ◻ **Şən qazanmaq** – şöhrət tapmaq, hörmət qazanmaq, məşhurlaşmaq, ad çıxartmaq. *..Şən qazanmağın özü də, əslinə baxsan, yaxşı sifətlərdən biridir.* Ü.Hacıbəyov. **Şəni uca olmaq** – ad-san qazanmaq, şöhrətlənmək, xalqın gözündə yüksəlmək. [Vəzir:] *..Əgər sən bir sənət və peşə bilsən, sənin şənin daha da uca olar.* Ü.Hacıbəyov. // Bir adama layiq olan keyfiyyət, sifət, ləyaqət, şərəf. *Ələsgər şənində desin dastanı; Fəxr eləsin doğan ana, can desin.* Aşıq Ələsgər. *Bu haman dayımdır ki, otuz il ondan sonra Sabir onun şəninə bir belə qəzəl yazdı.* C.Məmmədquluzadə. [Xan:] *Leylanın şəninə onda gərək sən; Burda bədahətən şeir deyəsən.* B.Vahabzadə.

◊ **Şəninə dəymək (toxunmaq)** – özü üçün alçaqlıq hesab etmək, mənliyinə toxunmaq. [Qoca:] *Ay Mirzə, niyə bəs kola girirsən? Yoxsa mal otarmaq sənin şəninə dəyir.* S.Rəhimov. **Şəninə kəsir saymaq** – özünə, adına layiq bilməmək, ar bilmək, özü üçün əskiklik saymaq. *Deyək lap Müqim bəy bilmədi, yaxud Zərrintac xanım da bu əhvalatı şəninə kəsir sayıb, sirri başqa bir kəsə bildirmədi, bəs onda bu daş-qaşın qədrini kim bilər?* S.Rəhimov. **Şəninə layiq bilməmək, yaraşdırmamaq (sığışdırmamaq)** – özünə layiq bilməmək, öz ləyaqətini gözləmək, nüfuzunu, heysiyyətini saxlamaq. *Yadlar ilə danışmaya, gülməyə; Hər sözü şəninə layiq bilməyə; Namünasib yerə gedib-gəlməyə; Namusu, qeyrəti, arı gərəkdir.* Q.Zakir. [Səmirə:] *Xüsusən ilk beşiyim Kəmalə birinci sinifdən əlaçı olduğu üçün müəllimlərinə zəif cavab verməyi şəninə sığışdırmırdı.* M.Hüseyn.

**ŞƏNBƏ** *is.* [*fars.*] Həftənin cümədən sonra gələn günü. *Şənbə günü.* – [Yusif:] *Uşaqlar, bilirsiniz, şənbə, nə təhər olsa, gedirəm.* Çəmənzəminli.

**ŞƏNDİR** *sif. dan.* Yavan, yağsız (çox zaman "şəndir-şündür" şəklində işlənir). *Şəndir ət.* – *Fəqir-füqəra, əlsiz-ayaqsızlar, yoxsullar, dilənçilər gəlib, sədəqə istədikdə min cür danlaqdan sonra, ağalar qoyunun sür-sümük və şəndir-şündüründən verib rədd edərdilər.* H.Sarabski.

**ŞƏNLƏNDİRİLMƏ** "Şənləndirilmək"dən *f.is.*

**ŞƏNLƏNDİRİLMƏK** *məch.* Şən edilmək, şadlandırılmaq, fərəhləndirilmək.

**ŞƏNLƏNDİRMƏ** "Şənləndirmək"dən *f.is.*

**ŞƏNLƏNDİRMƏK** *f.* Şən etmək, fərəhləndirmək, könlünü açmaq, canlandırmaq, ruhlandırmaq. *Şənləndirir hər kəsi; Bir musiqi məclisi.* A.Şaiq. *Bir neçə il sonra körpə uşaqlar* [Qədirgilin] *ailəsini şənləndirəcəkdi.* S.Hüseyn. *Səadət xanım məclisi qat-qat şənləndirdi.* Mir Cəlal.

**ŞƏNLƏNMƏ** "Şənlənmək"dən *f.is.*

**ŞƏNLƏNMƏK** *f.* 1. Sevinmək, fərəhlənmək, şadlanmaq, açılmaq; üzü gülmək. [Gəray:] *Söyləmiş, biz onunla əyləndik; O da şənləndi, biz da şənləndik.* A.Şaiq. *Gümüş qədəhləri qaldırın görək; Bu məclis şənlənib qızışsın gərək.* S.Vurğun.

2. *məc.* Canlanmaq, ruhlanmaq.

**ŞƏNLƏŞMƏ** "Şənləşmək"dən *f.is.*

**ŞƏNLƏŞMƏK** b a x **şənlənmək**.

**ŞƏNLƏTMƏ** "Şənlətmək"dən *f.is.*

**ŞƏNLƏTMƏK** b a x **şənləndirmək**. // *məc.* Canlandırmaq, can vermək. [Bəypolad Cəmil bəyə:] *Turxan bəydən ayrıldığımız gecə gözlərim bağçanı şənlədən çiçəklərə ilişdi.* H.Cavid.

**ŞƏNLİK** *is.* 1. Şadlıq, sevinc, fərəh. *O hara gəlsə şənlik gətirir.* – *İş keçsə bu surət bir müddət əgər; Qalmaz Qarabağda şənlikdən əsər.* Q.Zakir. *Bəndalı həmişə evə gələndə bir şənlik, xoşluq gətirərdi.* Mir Cəlal.

2. Təntənə, şadlıq məclisi, şadyanalıq, çalıb-çağırma, bayram. *Xalq şənliyi. Məktəbdə şənlik keçirilirdi.* – *Mədəniyyət sarayında bu gün şənlik vardı.* S.Rəhman. [Əsgər:] *Düşmən pilotu bizi görsəydi, yəqin ki, bir qatar pulemyot gülləsi atar, şənliyimizi pozmağa cəhd edərdi.* M.Hüseyn. ◻ **Şənlik etmək (eləmək)** – şadyanalıq etmək, deyib-gülmək, çalıb-çağırmaq, bayram etmək.

*Yığışın, şənlik edək, qərnimizin bayramıdır; Sil gözümdən bu yüz ildən bəri göz yaşlarımı.* Şəhriyar. *..Şura hökuməti qurulduğuna görə çayqıraqlılar şənlik eləyirlər*. Ə.Əbülhəsən.

**ŞƏNLİKSİZ** *sif.* Şənlik olmayan, çalçağırsız, sakit, süst. [Mirzə Mahmud:] *Mən də boynuburuq və peşman bir halda şənliksiz guşədə durub, aləmin böyük həngaməsinə tamaşa edirəm*. Çəmənzəminli. // Zərf mənasında. *Məclis şənliksiz keçdi*.

**ŞƏNLİK-ŞADLIQ** b a x **şənlik**. *Adət belədir – bayramda sevinib gülərlər, şənlik-şadlıq düzəldərlər*. M.İbrahimov.

**ŞƏN-ŞƏN** *sif.* və *zərf* Sevinə-sevinə, fərəhlə, şən halda, sevinclə. *Bu gördüyün şən-şən ellər bizimdir; Qarlı dağlar, coşqun sellər bizimdir*. A.Şaiq. *Yaşıl çəmən bayraq edər laləni; Ötərsiniz onda şən-şən, durnalar*. S.Rüstəm.

**ŞƏN-ŞƏRAFƏT** *is.* Hörmət, etibar, sayğı, şərəf, heysiyyət. *Şən-şərafətlə gün keçirmək. – Ağcanın uşaqlıq günləri beləcə şən-şərafətlə, əzizlik, bəxtiyarlıqla keçdi.* Mir Cəlal. // Əsil, nəcabət.

**ŞƏN(Ü) ŞÖVKƏT** *klas.* b a x **şan-şövkət**. *Deyildir bərabər heç kimsənəyə; Xubların şahıdır şənü şövkətdə.* M.P.Vaqif. *Şənü şövkət, ey əmir, səndən artıq kimdə yox; Həm ədalət, həm səxavət, həm şücaət səndə çox*. Ü.Hacıbəyov.

**ŞƏR** *is.* [*ər.*] 1. Pislik, yamanlıq, fənalıq, pis iş. *Xeyir və şər. – Şər deməsən, xeyir gəlməz*. (Ata. sözü). *Dünyanın gərdişindən; Təng oldum hər işindən; Mərdin başı qal çəkir; Namərdin şər işindən.* (Bayatı). *Bəxtəvər başına sənin, ey rəqib; Xeyir sənə qismət oldu, şər mənə*. Q.Zakir. [Cümrü Ağamalı] *xeyir və şərdə can-başla iştirak edərdi*. H.Sarabski.

2. Böhtan, iftira, fitnə, intriqa; xata, xatabala. [İmamverdi nəvəsinə:] *Yox, daha səni orada qoymaq olmaz. Mən azarlıyam, durmağa taqətim yoxdur, səni o iki şeytanın şərindən mühafizə etməyi bacarmıram.* S.S.Axundov. *Vaqonlar* [Rübabəni] *götürüb, sanki Gəldiyevin şərindən uzaqlaşdırmaq üçün yeyinlədilər*. Mir Cəlal. ☐ **(Üstünə) şər atmaq** – üstünə böhtan atmaq. [Gülnisə:] *Yalandır, atamın canı üçün yalandır; üstümə nahaqdan şər atırlar*. Ə.Haqverdiyev. [Süleyman Heydərquluya:] *Sən canını qurtarmaq üçün gərək Abbasın üstünə bir şər atasan.* M.İbrahimov. **Şərə düşmək** – dayanıb durduğu yerdə, nahaqdan böhtana, iftiraya məruz qalmaq, böhtana düşmək. *Şərə düşmək qəfil gülləyə düçar olmaq kimidir*. Ə.Vəliyev. **Şərə salmaq** – iftira edərək, böhtana salaraq dolaşdırmaq. [Vəzir:] *..Bir təhər elə, onu şərə sal, öldürək.* "Qurbani".

3. *sif.* Böhtançı, iftiraçı, fitnəçi, intriqaçı, xatakar. *Şər adamdır, ondan uzaq ol.*

◊ **Şər qarışmaq (qovuşmaq)** – qaranlıqlaşmaq, qaranlıq düşmək, qaş qaralmaq. *Şər qovuşanda dəstə kəndə çatdı*. – [Tahir:] *Maşınımın təkəri partlamışdı, dəyişdirib təzəsini taxanacan şər qarışdı*. M.Hüseyn. *Şər qarışanda məscid həyətinə otuza qədər gənc yığılmışdı*. Mir Cəlal. *Axşam şər qarışıb, qaş qaralanda; Şairin qapısı döyüldü birdən.* B.Vahabzadə. **Şəri başdan uzaqlaşdırmaq** – xata-balanı özündən uzaqlaşdırmaq, gözlənilən böhtanın, iftiranın qarşısını almaq, özünü xətərsizləşdirmək. [Salonda] *səslər eşidilməyə başlandı: – Bir gədənin birinə əlli manat verə bilməzsiniz ki, bir gecənin içində şərini başınızdan uzaqlaşdırsın*. M.S.Ordubadi. [Yaşlı kişi:] *Mən onu qovub şərini başımdan uzaqlaşdırmalı idim*. S.Hüseyn. **Xeyirə-şərə yaramaz** – b a x **xeyir-şər**.

**ŞƏR** *is.* [*ər.*] *klas.* Şəriət. [Şah:] *Əhkami-şərə mütabiq kimsənə nəzərdə varmı ki, səltənəti və təxtü tacı ona vagüzar edək?* M.F.Axundzadə. *Söz yox ki, badə şərdə olmuş bizə həram; Zənnim budur ki, yar ilə içsən həlal olur.* S.Ə.Şirvani.

**ŞƏRAB** *is.* [*ər.*] Üzümdən hazırlanan spirtli içki; çaxır. *Şərab şər gətirər*. (Ata. sözü). [Qaraş] *məclisdən-məclisə bir-iki qədəh şərab içsə böyük işdi.* M.İbrahimov. *Əlyarov qırmızı şərabla dolmuş stəkanı son damlasına qədər içib, şəstlə süfrəyə çırpdı*. M.Hüseyn.

**ŞƏRABÇI** *is.* 1. Şərab hazırlayan, çaxırçı.

2. Şərabsatan. *..Şərabçılar içəri girib ağızları yaşıl ipəklərlə sarınmış şüşələri açıb rətlin içinə tökməyə başladılar.* M.S.Ordubadi.

**ŞƏRABÇILIQ** *is.* 1. Şərab hazırlama, şərabçı peşəsi. *Şərabçılıqla məşğul olmaq*.

2. Üzüm və başqa meyvələrdən şərab hazırlama işi. *Şərabçılıq sənayesi.*

**ŞƏRABXANA** *is.* [*ər.* şərab və *fars.* ...xanə] Şərab çəkilən karxana; şərab çəlləklərinin saxlandığı yer. *Girdi şərabxanəyə bir gün pişik; Ta ki, siçan tutmağa çəkdi keşik.* S.Ə.Şirvani. // Şərabçı dükanı, şərab içilən yer; meyxana.

**ŞƏRABXOR** *sif.* [*ər.* şərab və *fars.* ...xor] Şərab düşkünü, içki düşkünü, içkiçi. *Alagöz Zərrintac xanıma, Cavanşirə sığınmaqla öz olan-qalan azadlığını da əlindən vermiş, bu ehtiraslı şərabxor xanıma bağlanmışdı.* S.Rəhimov. // İs. mənasında. *Bütün şərabxorlar kimi Qədirdə də bu ləyaqəti gözləmək əbəs idi.* Mir Cəlal.

**ŞƏRAFƏT** *is.* [*ər.*] Şərəf, hörmət, etibar. *Əql ilədir şərafəti-insan zəmanədə.* S.Ə.Şirvani. *Elm idi əgər bəxş edən insana şərafət; Millət nə səbəbdən ona göstərmədi rəğbət?* M.Ə.Sabir. // Heysiyyət, mənlik. [Gülnaz mübaşir Məmmədə:] *Şərafətiniz varsa, ağa, bu qapıdan qonaq kimi girmişsiniz, qonaq kimi də çıxıb gedin.* M.İbrahimov.

**ŞƏRAFƏTLİ** *sif.* və *zərf* Şərəfli, hörmətə layiq, mübarək, əziz. *Haman şərafətli ayın adı mahi-mübarəki-rəmazandır.* C.Məmmədquluzadə. [Növrəstə:] *Bugünkü bayramımızı şərafətli keçirməliyik.* Ə.Haqverdiyev.

**ŞƏRAİT** *is.* [*ər.* "şərt" söz. cəmi] 1. Bir şeyin həyata keçməsi üçün lazım olan şərtlərin məcmusu; vəziyyət. *Hər şey şəraitdən asılıdır. – Qəhrəman köhnə bir müəllim kimi mühit və şəraitə ciddi fikir verirdi.* S.Rəhimov.
2. Şərtlər. // Bir işin, hadisənin, prosesin baş verdiyi, cərəyan etdiyi mühit. *Həyat şəraiti. Danışıqlar qarşılıqlı anlaşma şəraitində keçdi.*

**ŞƏRAKƏT** *is.* [*ər.*] *klas.* Şəriklik, şərik olma, bərabər iştirak etmə, yoldaşlıq. ☐ **Şərakət etmək** – bir işdə yoldaşlıq etmək, iştirak etmək; şərik olmaq. *Sidqi bu ki, bu barədə rəyimdir əlavə; Sizlə edə bilməm də şərakət, uçitellər!* M.Ə.Sabir. *..Biz qonşularımızdan heç bunu gözləmirik də və görmürük də ki, onlar bizim cümələri tətil eləsinlər və bayramlarımıza şərakət etsinlər.* C.Məmmədquluzadə.

**ŞƏRAKƏTLİ** *sif.* və *zərf* Şərikli, müştərək, bir yerdə, ortaqlı. *Şərakətli bağ salmaq.* – [Fərhad:] *Siz xahiş eləsəniz, hər beş adama bir koma tikdirib şərakətli barama saxlaya bilərsiniz.* Ə.Haqverdiyev.

**ŞƏRAR(Ə)** *is.* [*ər.*] *klas.* Qığılcım. *Nagəhan bir şərarə qəlyandan; Düşdü əmməməsinə sol yandan.* S.Ə.Şirvani. *Gətirdiyin yumurtadan naticə cücə gözləmə; Qazanda qayğanağa bax, ocaqdakı şərarı gör.* M.Ə.Sabir.

**ŞƏRARƏLİ** *sif.* Qığılcımlı, qığılcımsaçan. *Qara buludlar Günəş şüasını bizdən gizləyirkən, gün o şərarəli oxlarını bizə çatdırmağa çalışırdı.* T.Ş.Simurq.

**ŞƏRARƏT** *is.* [*ər.*] *klas.* Yamanlıq, pislik, mərdimazarlıq, şər iş; fitnə; fəsad. *Hər kəs şərarət əksə, peşmanlıq bitər.* (Ata. sözü). *Həddən aşıb büxlü həsəd, şərarət; Yoldaş yoldaşına eylər xəyanət.* Q.Zakir. [Camal bəy:] *..Ağa İsmayıl bəy, fərağat otur, bəsdir şərarət.* N.Vəzirov. ☐ **Şərarət etmək** – şər iş görmək, yamanlıq eləmək, mərdimazarlıq eləmək; fitnə, fəsad salmaq. *Molla dayı, etmə şərarət belə.* M.Ə.Sabir.

**ŞƏRARƏTÇİ** *is.* Fitnəçi, fəsadçı, mərdimazar.

**ŞƏRBAF** *is.* [*fars.*] Nazik saplardan əl ilə bafta və sair bu kimi şeylər toxuyan, tikmə tikən usta. *Bir dənə dülgərimiz, bir dənə dərzimiz yoxdur. Papaqçı, dəmirçi, nalbənd, başmaqçı və şərbafdan başqa sənətkara gümanımız gəlmir.* Çəmənzəminli. *Ərlik yekə qızdır, deyirəm: get ərə, getmir; Şərbaf Qasıma, bəzzaz ağa Qənbərə getmir.* Ə.Nəzmi. [Ağasəfər] *bir-iki nəfər muzdurun bayaqkı qısaboylu şərbafa yaxınlaşdığını gördükdə canını dişinə tutaraq dedi.* Ə.Əbülhəsən.

**ŞƏRBAFLIQ** *is.* Şərbaf peşəsi, şərbaf sənəti. *Şərbaflıq eləmək. – Ömrünün tamam iyirmi dörd ilini Həmzənin toxucu karxanasında şərbaflıqla, muzdurçuluqla keçirən otuzyaşlı Veys, böyük peşmanlıqla öz-özünü danlayırdı.* Ə.Əbülhəsən.

**ŞƏRBAZ** *sif.* [*ər.* şər və *fars.* ...baz] Şər, böhtan atmağı sevən; iftiraçı, fitnəçi. *Şərbaz adam.*

**ŞƏRBƏT** *is.* [*ər.*] 1. Meyvə şirələrinə və ya adi suya qənd qatmaqla hazırlanan şirin içki. // Sirop. *Bayram zamanı hil, darçın, zəncəfil, qəhvə çayı da vermək adət idi. Bundan əlavə, şərbət də verərdilər.* H.Sarabski. *Surahılar şərbət və şərablarla doldurulub, sərin*

*bulaqlara qoyulmuş məzələr, xuruşlar boşqablara düzülmüşdü.* M.Rzaquluzadə.

2. *məc.* Müqayisələrdə şərbət kimi şirin şey mənasında. *Hər kəlmən şərbətdir, dodağın nabat; Haq səni göndərib aləmə sövqat.* (Qoşma). *Nə şərbətdir qəmin kim, içdikimcə əskilir səbrim; Nə sehr eylər rüxün kim, baxdığımızca rəğbətim artar.* Füzuli.

**ŞƏRBƏTÇİ** *is.* Şərbət hazırlayıb satan adam. *Yaşıl dalları ətrafa sarqan iri püsküllü söyüd altında şərbətçi sıra iskəmlə üzərində oturan müştərilərinə şərbət verir.* H.Cavid.

**ŞƏRBƏTÇİLİK** *is.* Şərbətçi peşəsi, şərbətçi işi.

**ŞƏRBƏTİ** *is.* Şərbət qabı. *Süfrəyə şərbətilər düzülmüşdü.*

**ŞƏRBƏTLİK** *is.* Şərbət hazırlamağa lazım olan, şərbətə yarar. *Şərbətlik ədvə. Şərbətlik şirə.*

**ŞƏRÇİ** *sif.* Şər söyləyən, başqasına şər atan, iftiraçı, böhtançı. *Şərçi adam.*

**ŞƏRƏF** *is.* [*ər.*] 1. İnsanın ictimai və şəxsi davranışında tutduğu mənəvi-əxlaqi prinsiplərin məcmusu; mənəvi yüksəklik, ululuq, heysiyyət. *Şərəfini qorumaq. – Ədəbdən, elmdən gər feyziyab olsa əvamünnas; Düşər şənü şərəfdən mollalar, işanlar, insanlar.* M.Ə.Sabir. // Fəxr, iftixar ediləcək şey. ..[Rüstəm bəy:] [Məşədi İbad ilə] *qohumluğu özüm üçün böyük bir şərəf hesab edirəm.* Ü.Hacıbəyov. // Namus, mənəvi saflıq, təmizlik, bəkarət. *Şərəfini ləkələmək. Qadınlıq şərəfi. – Telli kənd içində, el arasında* [İslamın] *papağını yerə soxmuş, namus və şərəfini ayaqlar altına salmışdı.* S.Hüseyn. *Odur ki, Qulu* [Teymurbəyi] *təhrik etmək üçün daim şərəf məsələsindən bəhs edərdi.* Çəmənzəminli. // Yaxşı ad, etibar. *Müəssisəmizin şərəfini qoruyaq.*

2. Ehtiram, sayğı, hörmət. *Xaki-dərgahinə hər sübh sürtər gün üzünü; Qaliba ondan ona hasil olubdur bu şərəf.* Füzuli.

3. **Şərəfinə** şəklində – birinə hörmət əlaməti olaraq, birinin adına, xatirəsinə. *Ceyran evdə olduqca böyük bir süfrə görür. Eldar onun şərəfinə böyük bir hazırlıq yapdırmış*(*dı*).. S.Hüseyn. [Firəngiz] *ilk badələri Səmədin şərəfinə qaldıraraq, öz sözləri ilə dedi.* B.Bayramov.

4. **Şərəflə** şəklində – ləyaqətlə, vicdanla, üzüağ. *Vəzifəsini şərəflə yerinə yetirmək. Vətən naminə şərəflə çalışmaq. – Qulaq as, gör anan nə öyüd verir; Şərəflə, vüqarla yaşayın ancaq.* S.Vurğun.

◊ **Şərəf lövhəsi** *köhn.* – istehsalatda ən yaxşı, ən qabaqcıl işçilərin adı və şəkli vurulan lövhə. *Sarayın geniş, işıqlı, yaraşıqlı foyesində neft qabaqcıllarının şəkilləri vurulmuş böyük şərəf lövhəsi var idi.* M.Rzaquluzadə.

**ŞƏRƏFƏ** *is.* [*ər.*] Minarənin azan verilən yeri. *Şərəfədən sonra davam edən çıxıntı isə minarənin ümumi vertikal kompozisiyasını tamamlayır.* Ə.Salamzadə.

**ŞƏRƏFLƏNDİRMƏ** "Şərəfləndirmək"dən *f.is.*

**ŞƏRƏFLƏNDİRMƏK** *f.* Şərəfli etmək, hörmətini, şərəfini artırmaq; başını uca etmək. *Öz gəlişinizlə məclisimizi şərəfləndirdiniz.*

**ŞƏRƏFLƏNMƏ** "Şərəflənmək"dən *f.is.*

**ŞƏRƏFLƏNMƏK** *f.* Şərəfli olmaq, şərəf və hörməti artmaq, etibarı, qiyməti artmaq, ucalmaq; başı uca olmaq. *Dağlar şərəflənər öz tərlanilə; Vətən fəxr eləyər qəhrəmanilə.* M.Rahim.

**ŞƏRƏFLİ** *sif.* 1. Hörmətli, ehtiramlı, sayğılı, vüqarlı, şanlı. *Müəllim adı şərəfli addır. – Adın şərəflidir sənin, ey qadın; Dahilər anası çağrılır adın.* S.Vurğun.

2. Hörmət, şərəf, şan-şöhrət gətirən, iftixar doğuran. *Şərəfli iş. Şərəfli əmək. Şərəfli zəhmət.*

**ŞƏRƏFSİZ** *sif.* Şərəfi, heysiyyəti olmayan; namussuz, vicdansız, alçaq, rəzil. *Kim keçər bu yerin daşından, deyin?! Vətəndən ayrılar hanki şərəfsiz?* S.Vurğun. *Heyhat! Bir gün, nə deyim, eloğlum, düşdün dara; Diri təslim olmadın şərəfsiz cəlladlara.* S.Rüstəm. // Rüsvayçı, biabırçı, rəzil, alçaq, pislənməyə layiq. *Şərəfsiz ölüm.*

**ŞƏRƏFSİZCƏSİNƏ** *sif.* və *zərf* Şərəfsiz surətdə, alçaqcasına, rəzalətlə, rüsvaycasına. *Şərəfsizcəsinə hərəkət* (*etmək*). *Şərəfsizcəsinə ölüm.*

**ŞƏRƏFSİZLİK** *is.* Şərəf və namusdan məhrumluq; şərəfi, heysiyyəti olmama; vicdansızlıq, alçaqlıq, namussuzluq, rəzillik. *Sevgi insanı bəzən şərəfsizliyə sürüklədiyi*

*üçün insan təhqirin acılıqlarını hiss etmir*. M.S.Ordubadi. *Cuma bu vaxta qədər belə bir şərəfsizliyə, tənəzzülə dözdüyünə indi təəccüb etməyə başlayırdı*. Ə.Əbülhəsən. // Zərf mənasında. *Şərəfsizliklə unutmaq*.

**ŞƏRƏFYAB** *sif.* [*ər.* şərəf və *fars.* yab] *klas.* Şərəf və hörmət qazanan, şərəflənən. ☐ **Şərəfyab etmək** *klas. tənt.* – şərəfləndirmək. *Hər ayinə belə olsa, o öz mədhiyyələrini və qəsidələrini söylər, məxlüqati-aləmi küllən feyzyab və şərəfyab edər*. S.Rəhimov. **Şərəfyab olmaq** *klas. tənt.* – ...şərəfinə nail olmaq, ...şərəf və etibarını qazanmaq. [Səttarxan:] *Ağaların burada olduğu vaxtda şərəfyab olmaq lazım idi*. P.Makulu.

**ŞƏRƏN** *zərf* [*ər.*] İslam şəriətinə uyğun olaraq, şəriətə görə, dini ehkamlara görə; şəriətcə. [Bəhram Pəriyə:] *Mənim səni öpməyə şərən ixtiyarım yoxdur*. C.Cabbarlı. [Mir Hadi:] *Oğul, Hacı ağa bu vəsiyyətnaməsində özü üçün ehsan, xeyrat ayırmayıb, qorxuram şərən düz olmasın*. Qantəmir.

**ŞƏRƏR(Ə)** [*ər.*] *klas.* bax **şərar(ə)**. *Şikəstə Zakirəm, ahım şərəri; Od salıbdı asimana, ay Mədəd!* Q.Zakir. *Ahın şərəri etməz əsər bir kəsə, Hophop; Bu od sənin ancaq alışan canın üçündür*. M.Ə.Sabir.

**ŞƏRƏŞUR(Ə)** *sif.* [*fars.*] *dan.* Hərəkətləri düz olmayan, cəncəl, xatakar, davaaxtaran. *Şərəşur adam*. – [Qara xan Koroğluya:] *Sən, deyəsən, şərəşurə adamsan*. "Koroğlu".

**ŞƏRƏŞURLUQ** *is. dan.* Düzgün olmayan işlər, xatakarlıq, davakarlıq. [Nəcmi:] *Hökumət ki, elm dalıncan düşdü, şərəşurluğa rəvac vermədi, ona bel bağlamaq olar*. Ə.Əbülhəsən.

**ŞƏRF** *is.* [*fars.*] Başa, boyuna sarımaq, yaxud çiyinə salmaq üçün uzunsov parçadan tikilmiş və ya yundan, iplikdən, ipəkdən toxunmuş məmulat. [Qəhrəman:] [Xanımın] *başında ağ ipək şərf var idi. O, bəzənmişdi*. H.Nəzərli.

**ŞƏRH** *is.* [*ər.*] Açma, anlatma, izah (etmə), təfsir (etmə), bildirmə. // Bir şey haqqında izahedici və tənqidi qeydlər, mühakimələr. *Siyasi mətbuatda şərh*. ☐ **Şərh etmək (eləmək, qılmaq)** – açmaq, anlatmaq, izah etmək. *Mən nə hacət ki, qılam daği-nihanim şərhin?* Füzuli. *Çox təbibə şərh elədim dərdimi; Heç görmədim çarələnmiş könlümü*. M.V.Vidadi. *Gəl yazaq şərt üçün öz tərcümeyi-halımızı; Həm də doğru olaraq şərh edək əhvalımızı*. M.Ə.Sabir.

**ŞƏRHÇİ** *is.* Yazı, hadisə və s.-ni şərh edən şəxs; kommentator. *Nəsirəddin istedadlı ədəbiyyatşünas olmaqla bərabər, görkəmli mütərcim, redaktor, mətnşünas və şərhçi olmuşdur*. "Ədəb. və inc.".

**ŞƏRİ**[1] *is.* [*ər.*] [*köhn.*] Nazik damar, kapillyar.

**ŞƏRİ**[2] [*ər.*] *din.* Şəriətcə qanuni, halal. ..[Məhkəmə] *Telli Rüstəm qızının əlindən yapışıb, onu öz şəri və halal əri İslama tapşırsın*. S.Hüseyn. // Şəriətə aid və ya müvafiq olan. *Nə cür olmasın ki, əqli və şəri dəlillərlə mübahisə edib həqiqəti axtaracağımız yerdə, hər birimiz başımıza bir avam dəstəsi yığıb* "*təkfir*" *silahı ilə vuruşmağa başlayırıq*. C.Məmmədquluzadə.

**ŞƏRİD** *is.* [*ər.*] 1. Lent, yastı qaytan. // İp. *İsti paltarların boğçadan çıxarılıb həyətlərdə, eyvanlarda çırpıldığını, şəridə asıldığını görmək olurdu*. Mir Cəlal. *Şəridi bağlamaq üçün çinarın gövdəsinə arvadların vurduqları dəmir çivləri, mıxları pas yeyib nəziltmişdi*. B.Bayramov.

2. Texniki və s. məqsədlər üçün işlənən hər hansı bir materialdan hazırlanan dar, uzun zolaq.

3. *məc.* Lent kimi uzanıb gedən şey haqqında. *Maşın böyük əziyyətdən qurtardığına sevinirmiş kimi, həvəslə qaçıb, elə bil, yolun boz şəridini təkərlərinə dolayırdı*. R.Rza. *Burada, aşağıda göz işlədikcə düzənliklər, sıx meşələr, gümüş şərid kimi axan çaylar, məxmər çəmənlər görünürdü*. M.Rzaquluzadə.

**ŞƏRİƏT** *is.* [*fars.*] İslam dini və hüquqi normalarının məcmusu, islam qanunları. *Mərifət şərbətin içə bilmirəm; Şəriət dəryadı, keçə bilmirəm...* Aşıq Ələsgər. *Əsmər yenə şəriətin hökmüncə* [Məmmədbağırın] *halal arvadı olub qalırdı*. S.Hüseyn.

**ŞƏRİƏTXANA** *is.* [*ər.* şəriət və *fars.* ...xanə] Ruhani idarəsi, qazıxana. [Nurəddin ağa:] *Cənab Heydər, qalx ayağa, gedək şəriətxanaya*. N.Vəzirov. // Mollaxana.

**ŞƏRİƏTMƏDAR** *is.* [*ər.* şəriət və *fars.* mədar] İslamda: şəriət qanunlarını şərh və

tətbiq etmək hüququna malik olan yüksək rütbəli din xadimi. [Mirzə Rəhim xan:] *Nə qədər ki, bu naməhrəmlik vardır, sənin işinə baxa bilmərəm. Çünki xilafi-şərdir. Şəriətmədarlara bu iş şayəstə deyil.* M.S.Ordubadi. *Şəriətmədarların içinə vəlvələ salan bir şair indi özü onların içinə gəlir, onların cərgəsində yer axtarırdı*. Mir Cəlal.

**ŞƏRİF** *is.* [*ər.*] *klas.* 1. Şərəfli, şərəf sahibi, mübarək, müqəddəs, əziz.

2. Nəcib, əsil, şərafətli, nəcabətli, əsilli.

**ŞƏRİK** *is.* [*ər.*] 1. Hər hansı bir işdə (ticarətdə və s.-də) başqası ilə birgə iştirak edən adam; ortaq. *Əbülhəsənbəy cavahirfüruş və onun şəriki Ağa Əsəd Tütünçü oğlu öz ticarət işlərinə baş çəkməkdən ötrü Culfaya gedirlər.* M.S.Ordubadi. *Hacı Nəsir ayrı bir yerdə yaşayan şərikilə hesab çəkməyə getmişdi.* S.S.Axundov. ☐ **Şərik etmək (eləmək)** – özünə ortaq etmək. [Əsgər bəy:] *Mən onun özünü də tovlaşdırıb özümüzə şərik edə billəm.* M.F.Axundzadə. [Ruqiyyə Əhmədə:] *Dərdinə məni şərik et*. A.Divanbəyoğlu. **Şərik olmaq** – 1) ortaq olmaq. *Alverdə şərik olmaq, ortaq olmaq;* 2) iştirak etmək, yoldaşlıq eləmək, birləşmək. *Öz müsibətimi unudub* [Xədicənin] *qəminə şərik oldum*. S.Hüseyn; 3) razılaşmaq, qoşulmaq. *Dostumun fikrinə şərik oldum*. **Şərik çıxmaq** – bir işdə iştirak etmədiyi halda, şəriklik iddiasında olmaq.

2. İştirak edən, əli olan, əlbir olan. [Fərraşbaşı:] *Bəli, batində o da Ağa Mərdanın şəriki imiş.* M.F.Axundzadə. [İbrahim bəy:] *..Belə işdə Camal bəylə şərik iş görənin biri də o Hacı Qurban lənətullahdır.* N.Vəzirov.

3. **Şərikəm** şəklində – razıyam, qoşuluram, etirazım yoxdur. [Həcər xanım:] *Mən də onun fikrinə şərikəm.* S.S.Axundov. [Ata:] *Mən sənin sözünə şərikəm, Heybət, – dedi.* S.Rəhimov.

**ŞƏRİKLƏŞMƏ** "Şərikləşmək"dən *f.is.*

**ŞƏRİKLƏŞMƏK** *f.* 1. Şərik olmaq, ortaq olmaq.

2. Razılaşmaq, həmrəy olmaq, qoşulmaq.

**ŞƏRİKLİ** *sif.* Ortaqlı, hamaş, birgə. *Şərikli mülk*. – [Mustafa bəy:] *Zalım uşaqları, mənimlə şərikli kəhriz çıxartdırıbsınız ki, suyumu da oğurlayırsınız.* Ə.Haqverdiyev. *Tahirzadənin ilk işi o oldu ki, şərikli kəsdikləri şişəyin bütöv bir şaqqasını ayırıb südçü məhəlləsinə, Məsmənin evinə göndərdi*. Mir Cəlal. // Bölünməz, ayrılmaz, ortaqlı. *Şərikli mal. Şərikli şey*.

**ŞƏRİKLİK** *is.* Ortaqlıq, hamaşlıq, müştərəklik. [Rüstəm:] *Hər kəs şəriklikdə işləməsə, ona heç bir şey verilməz.* T.Ş.Simurq.

**ŞƏRİKSİZ** *sif.* Heç bir şəriki, ortağı olmayan. *Şəriksiz mülk.*

**ŞƏRİR** *sif.* və *is.* [*ər.*] Şər işlər görən, iblis, fəsadçı, dələduz, yaramaz, pis (adam). *O səbəbə Xudayar bəy Zeynəbi boşamazdı ki, qorxurdu, şərir adamların birisi Zeynəbi ala və başlıya Xudayar bəydən səğirlərin mal-mülkünü iddia eliyə.* C.Məmmədquluzadə. [Camal bəy:] *Hərgah siz şərir adamların sözünə baxıb, inanıb iş görsəniz, uyezdi xaraba qoyarsınız*. N.Vəzirov.

**ŞƏRQ** *is.* [*ər.*] 1. Dünyanın dörd cəhətindən biri – günçıxan tərəfi; günçıxan, gündoğan. *Evin pəncərələri şərqə baxır. – Şərqdə dan yeri yenicə sökülürdü*. Ə.Sadıq. // Qərbə (günbatana) müqabil cəhət, istiqamət. *Şəhərin şərq tərəfində gözəl bağ salınmışdı. – Ərşad bilirdi ki, şəhərin şərq qurtaracağında Mahmud bəyin evlərini veriblər milis rəisinə*. İ.Əfəndiyev. *Şərqə doğru bir adam gedirdi*. Ə.Məmmədxanlı.

2. Günçıxan səmtdə yerləşən ölkələr (bu mənada "Ş" böyük hərflə yazılır). *Şərqə səyahət. Yaxın Şərq. Uzaq Şərq. Şərqi öyrənmək. – Elə ucaldı ki, o böyük insan; Şərqin hər yerindən xalqa göründü*. B.Vahabzadə. // Həmin ölkələrə aid olan, mənsub olan. *Şərq memarlıq abidələri. Şərq mədəniyyəti. Şərq xalqları. –* "*Şəbi-hicran*"*, qoca Şərqin öz varlığı, öz adıdır; Məhkum olan millətlərin* "*yandım*" *deyən fəryadıdır.* B.Vahabzadə.

**ŞƏRQİ¹** *sif.* [*ər.*] Şərqə aid olan, Şərqə məxsus olan, Şərq ilə bağlı. *Şərqi Avropa. Şərqi Sibir.*

**ŞƏRQİ²** *is.* [*ər.*] Nəğmə, mahnı. *Günəş qübbənin ortasına gələr-gəlməz bir şərqi səsi eşidildi*. Çəmənzəminli. *Vücudunun son bahar yarpağından fərqi yox; Dodağında bir gülüş, bir qaynayan şərqi yox.* M.Müşfiq. *Bir doyumluq möhlət umdum ömürdən; Qara dəniz, heç şərqindən doymadım.* M.Araz.

**ŞƏRQİYYUN** *is.* [*ər.*] *kit.* 1. Şərq məmləkətləri əhalisi, şərqlilər, Şərq xalqı.

2. B a x **şərqşünas**.

**ŞƏRQLİ** *sif.* Şərq ölkələrindən birinin əhalisinə mənsub olan adam, Şərq əhli. *Şərqlilərin adət və ənənələri. Şərqli geyimində bir adam. – ...Şərqlilərin zövqünü korlayıb hətta ruhlarını belə incidən bir şey varsa, o da bu saxta "Şərq stili"dir...* Ü.Hacıbəyov.

**ŞƏRQŞÜNAS** *is.* [*ər.* şərq və *fars.* ...şünas] Şərqşünaslıq mütəxəssisi. *M.F.Axundzadənin komediyaları 1817-1874-cü illərdə Mirzə Cəfərin tərcüməsi ilə fars dilində Tehranda daş çapı ilə nəşr olunmuşdur. Avropa şərqşünasları bizim yazıçının əsərləri ilə bu tərcümənin sayəsində tanış olurlar.* Ə.Haqverdiyev.

**ŞƏRQŞÜNASLIQ** *is.* Şərq ölkələrinin tarixini, iqtisadiyyatını, dillərini, mədəniyyətlərini və s. öyrənən elmlərin hamısına verilən ümumi ad. *Azərbaycan Elmlər Akademiyası Şərqşünaslıq İnstitutunun arxiv şöbəsində şərqşünaslığa aid nadir elmi əsərlərin fotosurətləri və mikrofilmləri toplanmaqdadır.*

**ŞƏRM** *is.* [*fars.*] *klas.* Abır, həya, utanma, xəcalət. *Nə rəhm bilər, şərm qanar, ağlamaq anlar; Böylə fələk olmaz.* M.Ə.Sabir. ☐ **Şərm etmək (qılmaq, eyləmək)** *klas.* – utanmaq, həya etmək, xəcalət çəkmək. *Arif ola, eyhamnan söz qana; Naməhrəmdən şərm eyləyə, utana.* Aşıq Ələsgər.

3. "İlə" qoşması ilə – utana-utana, xəcalət çəkərək.

**ŞƏRMƏNDƏ** *sif.* [*ər.*] *klas.* Utanan, utancaq. // Xəcalətli, üzüqara. *Deyirlər ki, sabah gələcək yarım; Şərməndəyəm, artıb dərdü qubarım.* Q.Zakir. [Güllü:] *Allah gətirib, salıb məni bu odun-alovun içinə. Qohumdan şərməndə, dostdan, aşnadan şərməndə.* Ə.Haqverdiyev. ☐ **Şərməndə etmək (qılmaq)** – utandırmaq, xəcalət çəkdirmək. *Bağda gülü şərməndə qılar qönçə dodağım; Süzgün baxışım, qarə gözüm, alma yanağım.* M.S.Ordubadi. **Şərməndə olmaq** – utanmaq, xəcalət çəkmək, xəcalətli olmaq. [Molla İbrahim Xəlil:] *Vallah, sizin kimi əziz qonaqlardan şərməndə oluram.* M.F.Axundzadə. *Tellərin dönüb kəməndə; Gözəllər olub şərməndə; Qara saçın dal gərdəndə; Hör, başına dolandığım.* Aşıq Hüseyn.

**ŞƏRMƏNDƏLİK** *is.* Utanma, xəcalət çəkmə, utanılacaq hal, vəziyyət; üzüqaralıq. *Bəsdir mənə çəkdiyim xəcalət; Şərməndəliyimdəki məlamət.* Füzuli.

**ŞƏRMSAR** *is.* [*fars.*] b a x **şərməndə**. *Minmin şükürlər olsun, ancaq sənin sayəndə; Olmadıq bu həyatda biz şərmsar, musiqi.* Şəhriyar.

**ŞƏRMSİZ** *sif.* Abırsız, həyasız, utanmaz. [Səlbi:] *Sizin əndamınıza piltə qoyulsun, ay şərmsiz, həyasız şəhər qızları.* Ə.Vəliyev.

**ŞƏRT** *is.* [*ər.*] 1. Bir şeyin var olması, həyata keçməsi üçün lazım olan amillər; əsas, zəmin. *Fiziki hazırlıq uçuş üçün əsas şərtdir. İcranın yoxlanması müvəffəqiyyətin mühüm şərtidir. – Yalnız qabaqcıl fikirlərlə yaşamaq azdır, bu fikirləri yüksək bədii şəkildə əks etdirmək də sənət əsəri üçün zəruri şərtdir.* M.İbrahimov.

2. Bir-birilə saziş bağlayan tərəflərdən hər hansı birinin irəli sürdüyü tələb və ya təklif. [Məmmədbağır] *axırda Əsməri tapıb onunla evləndi, çünki Əsmər onun istədiyi şərtlərə tamamilə uyğun idi.* S.Hüseyn. ☐ **Şərt etmək (qılmaq, kəsmək)** – əvvəlcədən razılaşmaq, uzlaşmaq, sözü bir etmək, kəsdirmək. *Aqibət şərt qıldı iki təbib; Hərə bir zəhr eyləsin tərtib.* S.Ə.Şirvani. [Zakirov Nisə xanıma:] *Nisə, evdən çıxanda səninlə söz danışdıq, şərt kəsdik.* Ə.Məmmədxanlı.

3. Müqavilənin, tərəflərin bu və ya digər öhdəliyini müəyyənləşdirən maddəsi. ☐ **Şərt bağlamaq** – bir şey haqqında razılığa gələrək yazılı və ya şifahi şəkildə qarşılıqlı öhdəlik götürmək.

4. İki və ya bir neçə şəxs arasında saziş, uzlaşma, bağlaşma, şərtləşmə. *Şərtə görə o, işi dünən qurtarmalı idi.* ☐ **Şərt bağlamaq** – müqavilə (saziş) bağlamaq, şərtləşmək. *Sizin yanınızda şərt bağladıq biz; Boyun qaçırmadıq öz vədimizdən...* S.Vurğun.

◊ **Şərti şumda kəsmək** – sonradan mübahisə, anlaşılmazlıq olmasın deyə, bir şey haqqında qabaqcadan razılığa gəlmək, əvvəlcədən razılaşmaq, şərtləşmək, qərarlaşmaq. *Dəstəyə təzə adamlar gələndə Şamil əvvəlcədən şərti şumda kəsərdi.* M.Hüseyn.

[Allahqulu:] *Kənddə belə məsəl çəkərlər ki, "şərti şumda kəsək, xırmanda yaba qapmayaq"*. Ə.Əbülhəsən.

**ŞƏRTİ** *sif.* [*ər.*] 1. Aralarında şərtləşdirilmiş, qabaqcadan şərtləşmiş. *Partizanlar meşənin kənarında durub şərti işarəni gözləyirdilər*. S.Vəliyev.

2. Müəyyən şərtlərlə məhdud edilmiş, ancaq müəyyən şərtlər əsasında qüvvəsi olan. *Şərti razılıq. Şərti cəza* (*cəzaya məhkum olmuş şəxsin sınaq müddəti ərzində heç bir günah işləmədiyi təqdirdə həyata keçirilməyən cəza*).

3. Nisbi, məşrut; başqa şəraitdə başqa cür ola bilən. *Həyatda bir çox şey şərtidir. Deyilənlərin hamısı şərtidir.*

4. Həqiqətdə təsvir edildiyi, göstərildiyi şəkildə mövcud olmayan. *Hüdudlar arasında şərti xətt çəkmək. Bir şeyin şərti təsviri.*

5. Hadisəni olduğu kimi yox, simvolik surətdə əks etdirən, qeyri-real. *Şərti səhnə kompozisiyası. Şərti gözəllik.*

**ŞƏRTİLİK** *is.* Şərti olma. *Cəzanın şərtiliyi.*

**ŞƏRTLƏNDİRİLMƏ** "Şərtləndirilmək"dən *f.is.*

**ŞƏRTLƏNDİRİLMƏK** *məch.* Bir şərtlə bağlanmaq, qabaqcadan şərt qoyulmaq, müəyyən şərtlərə tabe və ya onlarla məhdud edilmək.

**ŞƏRTLƏNDİRMƏ** "Şərtləndirmək"dən *f.is.*

**ŞƏRTLƏNDİRMƏK** *f.* 1. Bir şərtlə bağlamaq və ya məhdudlaşdırmaq, şərt qoymaq.

2. Bir şeyin törəməsinə əsas olmaq, səbəb olmaq. *Aydındır ki, xalqlar arasındakı belə dərin münasibət öz növbəsində yüksək səviyyədə duran millətin ədəbiyyatının o biri millətlərin ədəbiyyatları üzərinə təsirini də şərtləndirir.* M.Hüseyn.

**ŞƏRTLƏŞMƏ** 1. "Şərtləşmək"dən *f.is.*

2. Şərtnamə.

**ŞƏRTLƏŞMƏK** *f.* Bir-birilə şərt bağlamaq, qabaqcadan sözləşmək, söz qoymaq, vədələşmək, müəyyənləşdirmək. *Professor Aslanla şərtləşdiyi yerdə görüş*(*dü*).. M.Rzaquluzadə.

**ŞƏRTLİ** *sif.* Əvvəlcədən şərtləşdirilmiş, şərt qoyulan, müəyyən şərtlə bağlı olan.

**ŞƏRTNAMƏ** *is.* [*ər.* şərt və *fars.* ...namə] İki tərəfin razılığı əsasında yazılı şəkildə tərtib edilən bağlaşma, müqavilənamə; kontrakt. *Mədət muzdurlar komitetinin təlimatçılığı vəzifəsində çalışar, əsas etibarilə kulaklarla muzdurlar arasında şərtnamə bağlardı.* S.Rəhimov.

**ŞƏRTSİZ** *sif.* Heç bir şərtlə məhdudlaşmayan, bağlı olmayan, şərtlənməyən; danışıqsız. // Zərf mənasında. *Təkliflərin şərtsiz qəbulu.*

**ŞƏRT(İ)-ŞÜRUT** b a x **şərt** 2-4-cü mənalarda. *Müsəlmanın da öz şərt-şürutu var.* C.Məmmədquluzadə. ☐ **Şərt(i)-şürut bağlamaq** – şərtləşmək, şərt bağlamaq. ..*Cəlil ağa Olya ilə şərti-şürut bağlayırdı ki, o, sirkdən çıxsın və həmişə ona yar olsun, yoldaş olsun.* İ.Musabəyov.

**ŞƏST** *is.* [*fars.*] Ləyaqət, vüqar, şərəf, heysiyyat; təşəxxüs. // **Şəstinə** şəklində – şəninə, adına, ləyaqətinə. *Dərədən çıxanda bir bölük qazaq; Aynalı işlədi, qopdu tozanaq; Nəbinin şəstinə bu sözü yazaq.* "Qaçaq Nəbi". ☐ **Şəstinə dəymək (toxunmaq)** – mənliyinə toxunmaq, özünə layiq bilməmək ad-sanına, hörmətinə toxunmaq; şəninə kəsir saymaq.

**ŞƏSTLƏ** *zərf* Vüqarla, qürurla, təşəxxüslə, lovğa-lovğa. *Şəstlə qabağa gəlmək. Şəstlə durmaq. – Hünər istər ki, İskəndər kimi bir şit gəlib şəstlə dursun meydanda və desin: – Cənab Şeyx, hər nə qədər bu qəbiristanlıqda ölü dəfn olunub, hamısını dirilt.* C.Məmmədquluzadə. [Əbuzərbəy] *əllərini şalvar cibinə salıb, zabitin yanında şəstlə dayanmışdı.* M.Hüseyn.

**ŞƏŞBƏR** *sif. məh.* Yoğun, dik bığ. *Bir sənin şəşbər bığın yüz Nikolaya dəyər.* S.Rəhimov.

**ŞƏŞBƏRLƏMƏ** "Şəşbərləmək"dən *f.is.*

**ŞƏŞBƏRLƏMƏK** *f. məh.* Dikəltmək, qalxızmaq, qabartmaq.

**ŞƏŞƏƏ** *is.* [*ər.*] *klas. tənt.* 1. Parlaqlıq, parlama, parıltı. *Şəmi-rüxün surəti qarşıma gəlmişdir; Şəşəəsindən bənə şölə düşər, yanaram.* Nəsimi.

2. *məc.* Dəbdəbə, təmtəraq; zahiri bəzək, zinət, parlaqlıq.

**ŞƏŞƏƏDAR** *sif.* [*ər.* şəşəə və *fars.* ...dar] *klas. tənt*. Parıldayan, parlayan, parıltılı. *Mənsur axırıncı gücünü yığıb qanlı göz yaşları arasından: – Sitarə! Məni yandırma, gəl, gəl, ey həyatımın zöhreyi-şəşəədarı*. C.Cabbarlı. // B a x **şəşəəli**.

**ŞƏŞƏƏLİ** *sif.* Təntənəli, dəbdəbəli, təmtəraqlı, parıltılı. *İkinci məclis birinci şəkil İsfəhan şəhərində, padşahın sarayında vaqe olur. Saray mümkün mərtəbədə şaşəəli döşənmişdir.* Ü.Hacıbəyov. [Nigarın] *üzündə gənclik təravəti o qədər şaşəəli idi, danışanda səsində bəkarət canlanır, süslənirdi.* Çəmənzəminli.

**ŞƏTARƏT** *is.* [*ər.*] *klas.* Şənlik, şuxluq. [Sevda:] *Heyrət!.. Nə gözəllik, nə şətarət; Seyr et! O nə daşqınca bəkarət.* H.Cavid. *Əşrəf indi büsbütün dəyişmiş, əvvəlki gözəlliyini, şən və şətarətini itirmişi*(*di*).. A.Şaiq.

**ŞƏTARƏTLİ** *sif.* Şən, sevincli, şux. *Şətarətli nəğmə. – Nə şətarətli bahar, iştə baxın; Sarmış ətrafı bədii bir axın.* H.Cavid.

**ŞƏTƏL¹** *dan.* b a x **cığal**. *Şətəl adam.*

**ŞƏTƏL²** *is. məh.* Yun corab.

**ŞƏTƏLLİK** b a x **cığallıq**. *Şətəllik eləmək.*

**ŞƏTRƏNC** *is.* [*fars.*] Şahmat. *Zülm zəncirinin altında çəkir işgəncə; Eybdir sən uyasan gəncəfəyə, şətrəncə.* A.Səhhət. [Rəmziyyə] *rusca az-çox oxuyur, yazır, danışır, nərd, şətrənc oynamağı, yoldaşlarını məşğul etmək yollarını bilir*(*di*). A.Şaiq.

**ŞƏVƏ** *is.* [*fars.*] 1. Əqiq (qiymətli daş).

2. *məc.* Qara. *Şəvə saç. Şəvə bığ.* – [Zabit:] *Yox, birdən-birə o şəvə gözlər açılıb adamın üzünə baxanda Günəş qabağında polad kimi şəfəqlənib, ox kimi insanın ürəyindən keçir.* E.Sultanov. □ **Şəvə kimi** – zil qara, qapqara. [Məşədi İbad:] *Mən saqqalıma həna qoydum, qoymadım, həmişə qapqara şəvə kimidir.* Ü.Hacıbəyov. [Nuriyyə:] [Leytenantın] *səsini eşidib, ay işığında şəvə kimi parlayan iri, qara gözlərini görərkən diksindi.* İ.Əfəndiyev. // Qara rəngli iri, qiymətli muncuq; qara kəhrəba. [Xanımın] *ətəyində bir sıra əşrəfi, boynunda qızıllı şəvəsi vardı.* Çəmənzəminli.

**ŞƏVƏL** b a x **şax-şəvəl**.

**ŞƏVƏLLİK** *is.* Şəvəl tökülmüş yer. [Cəmillə Səltənət] *dəhrələri və ipləri ağacın altına qoyub, qalın şəvəlliyə girdilər.* Ə.Vəliyev.

**ŞƏVƏSAÇ** *sif.* Saçı qapqara olan. *Qara şəvəsaç gəlin; Dur qapını aç, gəlin; Atan səni verməyir; Kəhəri min qaç, gəlin.* (Bayatı).

**ŞƏVVAL** *is.* [*ər.*] Hicri qəməri ərəb təqvimində onuncu ayın adı. [Sara xanım:] *Demisən ki, şəvval ayının birində gərək hamı latın dili danışsın, bu da borcuma deyil, bir sən bil, bir də sənin Allahın bilsin.* Qantəmir.

**ŞƏYATİN** [*ər.* "şeytan" söz. cəmi] Şeytanlar. [Salman bəy:] *Bu ev cin, şəyatin ocağıdı.* N.Vəzirov.

**ŞIDIRĞI** *sif.* 1. Arasıkəsilmədən şiddətlə yağan; gur (yağış haqqında). *Amma məzə burasındadır ki, yağış da nataraş kimi başlayır şıdırğı ilə yağmağa.* C.Məmmədquluzadə. *Toran qarışanda şıdırğı yağış başladı və Əziz bundan da xəbər tutmadı... Dünyadan səssiz-səmirsiz köçdü.* İ.Məlikzadə.

2. *məc. zərf* Aravermədən, cəld, çox sürətlə. *Başqa şeydə göstərirəm istedadımı; Mən şıdırğı həftədə bir roman yazıram.* S.Rüstəm.

**ŞIĞIMA** "Şığımaq"dan *f.is.*

**ŞIĞIMAQ** *f.* 1. Çox böyük sürətlə enərək hədəfə hücum etmək, üzərinə atılmaq. *Təyyarələr düşmən üzərinə şığıdılar. – Mübaşir Məmməd* [Gülnazın] *üstünə şığıdı.* M.İbrahimov. *İki qartal qıy vuraraq şığıyır və qəzəblə didişirdi.* Ə.Sadıq.

2. Çaxmaq. *Hava qaralır, ildırım şığıyır, göy peydərpey guruldayır.* Ə.Haqverdiyev. *Dağlar titrədi, göy qübbəsini doğrayan ildırımlar şığıyıb qızıl oxlarını qılınc qayaların təpələrinə sancdı.* Ə.Məmmədxanlı. *..Buludlarda şığıyan şimşəklərdən yerə tökülən qığılcımlar hər tərəfi çulğayan bir yanğına çevrilir.* M.Rzaquluzadə.

**ŞIĞIYICI: şığıyıcı təyyarə** – şığıma üsulu ilə hücum edən hərbi təyyarə.

**ŞIQ (ŞIK)** [*fr.* chic] *dan.* Zahiri bəzək, zinət, dəbdəbə, cah-calal. // Gözəl, zərif, moda ilə, süslü, qəşəng. *Ortaboylu, şıq qiyafəli bu oğlan heç kəsə diqqət etməyərək yalnız parada baxırdı.* M.S.Ordubadi. *O vaxt Əhməd də .. gimnaziya tələbəsi idi, həm də Əhməd şıq gəzən tələbələrdən idi.* T.Ş.Simurq. [Musanın nəvəsi] *öz şəhərinə qayıdanda o qədər şıq, o qədər zərif geyinmişdi ki, hamının gözü bunda idi.* Qantəmir.

**ŞIQQ** *təql.* Sınan və ya bir-birinə toxunan ağac və s. bərk, kövrək şeylərdən çıxan səs.

**ŞIQQAŞIQ** *zərf* Şıqq səsi çıxardaraq, şıqqıldayaraq. *Külək əsdikcə kollar şıqqaşıq salır.*

**ŞIQQILDAMA** "Şıqqıldamaq"dan *f.is.*

**ŞIQQILDAMAQ** *f.* Şıq-şıq səs çıxarmaq.

**ŞIQQILTI** *is.* Ağac, budaq və s. bərk, kövrək şey bir-birinə dəydikdə hasil olan səs. *..Mirzə Cəmil kəhrəba təsbehini əlinə alıb, əsəbi halda çevirir, muncuqların şıqqıltısından həzz alırdı.* Ə.Vəliyev.

**ŞIQLIQ** *is.* Zəriflik, gözəllik, qəşənglik, modaya uyğunluq. *Paltarın şıqlığı. Yaşlı adama o qədər şıqlıq yaraşmaz.*

**ŞILLAQ** *is.* Ayaqla vurma, təpik atma; təpik. *Kəndliyə gəldi, vurdu bir şıllaq; Arıları dağıtdı ol sarsaq*. S.Ə.Şirvani. [Kişi:] *Gərək* [atın] *başını çəkəm, qorxuram, şıllağa qalxıb özünü səqət eləsin*. S.Rəhimov. ☐ **Şıllaq atmaq** – 1) təpik atmaq, şıllaqlamaq. *Düz yerdə gəzə bilmir, şumda şıllaq atır.* (Məsəl). *Tüfəng açılan kimi, onun səsindən ürkən eşşək bir qoşa şıllaq atdı..* M.Rzaquluzadə; 2) *məc. dan. Qızışmaq, həyasızlaşmaq, cızığından çıxmaq.* [Cəbi:] *O arvaddan həzər etmək gərək, hansı ki, əri evdən gedəndən sonra şıllaq ata*. N.Vəzirov. // Azğınlaşmaq, qudurmaq. [Kürd Musa:] *Ay Eldar! Doğrusu bu bəylər ki, var; Bir azca arpası çox düşən zaman; Yabı cinsi kimi şıllaq atırlar*. S.Vurğun. **Şıllağa durmaq** – b a x **şıllaq atmaq** 2-ci mənada. [Hacı Murad:] *..Yeyin mənim yağlı-yağlı xörəklərimi, sonra qızışıb şıllağa durun.* S.S.Axundov.

**ŞILLAQATAN, ŞILLAQÇI** *sif.* Təpik (şıllaq) atmaq xasiyyəti olan. *Şıllaqatan at.*

**ŞILLAQLAMA** "Şıllaqlamaq"dan *f.is.*

**ŞILLAQLAMAQ** *f.* Şıllaq atmaq, təpik atmaq.

**ŞILLAQLAŞMA** "Şıllaqlaşmaq"dan *f.is.*

**ŞILLAQLAŞMAQ** *qarş.* Bir-birinə şıllaq atmaq, təpik atmaq, təpikləşmək (at və s. haqqında).

**ŞILTAQ** 1. *is.* Mənasız tələb, iddia, arzu, istək. *Vəliqulu da başlayıb şıltağı və davamərəkəni.* C.Məmmədquluzadə. [Əlyarov:] *Hər yoldan ötənin şıltağından ötrü biz adamlarımızı çölə tökə bilmirik ki?* M.Hüseyn. // *sif.* Daim şıltaqlıq edən, şıltaqçı. *Dürdanə xanımın qızı Sonanı da, o baş çıxarmadığı şıltaq qızı da indi Qadir görmək istəmirdi.* Ə.Əbülhəsən. // Ağlayıb-qışqırmaqla öz istəyindən əl çəkməyən; inadcıl, inad, tərs. *Şıltaq uşaq*. // Kefsizlik, ağrı və s. səbəblər üzündən uşaqlarda ağlamaq və ya çığırmaq şəklində təzahür edən narahatlıq, əsəbiyyət halı. [Atabala] *bu çocuğun nazını çəkir, hər şıltağına dözür*. A.Şaiq. ☐ **Şıltaq etmək (eləmək)** – 1) ağlamaqla narahatlığını bildirmək. *Balaca uşaqlar gecə yatmayıb şıltaq eləyəndə, anaları istəməyiblər şirin yuxudan ayılıb uşağa süd versinlər*. C.Məmmədquluzadə; 2) *məc.* Naz eləmək, özünü ərköyün kimi aparmaq. *Qız çox şıltaq edəndə Bülənd ona nəsihət edərdi.* Ə.Əbülhəsən.

2. *sif. məc.* Dəyişkən, qərarsız, sabit halda olmayan, gözlənilmədən dəyişən. *Şıltaq dəniz. Şıltaq hava. – Necə sakitcə, baxır gör, necə şıltaq Xəzərim; Başqa aylardasa hər dalğası bir dağ Xəzərim*. S.Rüstəm.

**ŞILTAQCIL** b a x **şıltaq**.

**ŞILTAQÇI** *sif.* 1. Şıltaq, şıltaqlıq edən, heç şeydən razı qalmayan. [Əbülhəsənbəy:] *Mən qarşımda .. şıltaqçı bir qız görürdüm.* M.S.Ordubadi. [Bacım:] [Xədicə] *xəstədir, anası yoxdur, şıltaqçıdır*. S.Hüseyn.

2. Ağlağan, tərs, inadcıl. *Çoxlarının bezdiyi və uzaq qaçdığı inadlı, şıltaqçı və ağlağan uşaqları Nazimə sanki əfsun ilə ələ alır.* Mir Cəlal.

**ŞILTAQLIQ** b a x **şıltaq** (1-ci mənada). *Mən onu özümdən razı salmaq üçün hər işi bacarardım, nə inad, nə də şıltaqlığa yol verməzdim.* M.S.Ordubadi. [Əyyar:] *Bir ərköyün uşaqsan sən; Şıltaqlıqdır işin-peşən*. A.Şaiq. [Tərlan:] *Mən qız deyiləm, şıltaqlıq eləyəm*. M.Hüseyn.

**ŞINDIR** *is.* Ətin atılan hissələri.

**ŞIPPILTI** *is.* Bir şey suya düşdükdə və ya suya dəydikdə, yaxud da dalğalar bir-birinə dəydikdə hasil olan səs. *Avarların şıppıltısı. Dalğaların şıppıltısı.*

**ŞIRHAŞIR(LA)** *zərf* Şır-şır səs çıxaraçıxara, şırıltı ilə. *Su şırhaşırla yerə töküldü*. M.İbrahimov. [Afaq:] *Mən bu vətən torpağını yaxşı tanıyıram, elə ki insan əli ona toxundu, elə ki şırhaşır su axıb gəldi, o, təzədən çiçək açıb gülüstana çevriləcək*. Ə.Məmmədxanlı.

**ŞIRILDAMA** "Şırıldamaq"dan *f.is.*

**ŞIRILDAMAQ** *f.* Şırıltı ilə axmaq, tökülmək (su, yağış və s.). *Bulaqların daşdan-daşa tökülüb şırıldamağı gözəl bağlara bir ayrı lətafət verirdi*. Çəmənzəminli. *Dalbadal şimşək çaxdı və sonra yağış şırıldadı*. İ.Əfən-

diyev. [Mələk:] [su] *yenə qayaların arasından sızdıqca şırıldayırmı?* İ.Şıxlı.

**ŞIRILDAŞMA** "Şırıldaşmaq"dan *f.is.*

**ŞIRILDAŞMAQ** *f.* Şırıltı ilə, şır-şırla axan çoxlu və ya çağlayan su haqqında; şırıldamaq. *Aşağılarda yaşıl otlar su ilə öpüşür, şəlalələr şırıldaşır.* M.Hüseyn.

**ŞIRILDATMA** "Şırıldatmaq"dan *f.is.*

**ŞIRILDATMAQ** *f.* Şırıltı ilə tökmək, axıtmaq, birdən tökmək, boşaltmaq (maye şey haqqında). [Roza] *dolçadakı ılıq suyu qaldırır, birdən-birə ləyənə şırıldadır*. S.Rəhimov.

**ŞIRILTI** *is.* Axan, tökülən sudan hasil olan səs; şırıldama səsi, şır-şır. *Suyun şırıltısından savayı bir səs, ün yox idi.* E.Sultanov. *..İki qrantdan su şırıltı ilə tökülürdü iki hovuza*. C.Məmmədquluzadə. *Yaxındakı bulağın şırıltısı gecənin sakitliyi içərisində həzin bir inilti kimi eşidilirdi*. S.Hüseyn.

**ŞIRILTILI** *sif.* Şırıltı ilə axan, şır-şır axan. *Oğlanları baş daşını; Qoydu onun həmin dağda; Ona şirin nəğmə dedi; Şırıltılı gur bulaq da.* M.Dilbazi.

**ŞIRIL-ŞIRIL** b a x **şır-şır**. *Səhər şırıl-şırıl səsin gələndə; Bənəfşələr gülsün, güllər sevinsin*. R.Rza. *Axıb gedir qapımızdan kiçik çay şırıl-şırıl*. Z.Xəlil.

**ŞIRIM** *is.* 1. *k.t.* Torpaqda kotanın və ya başqa alətin açdığı dərin iz, zolaq. *Tarlalar şırımlarla suvarılır. – Gülşən dayanıb traktorun səsinə qulaq asır, çevirdiyi torpağa, açdığı şırımlara tamaşa edirdi.* Ə.Vəliyev. *Şumlanan düzlərə baxıram, odur; Uzanır çöl boyu ağ-ağ şırımlar.* Ə.Cəmil.

2. *məc.* Zolaq, xətt, tikiş yeri, çapıq yeri. *Üz-gözündə şırım görünür.*

**ŞIRIMLAMA** "Şırımlamaq"dan *f.is.*

**ŞIRIMLAMAQ** *f.* 1. Şırım açmaq.

2. *məc.* Şırım-şırım eləmək, cırmaq.

**ŞIRIM-ŞIRIM** *sif.* Zolaq-zolaq, zol-zol, cızıq-cızıq, şırımlar halında. *Şırım-şırım paltar. – Mehmanxanada ilk nəzərə dəyən birinci mərtəbədəki böyük dairəvi dəhlizin bir neçə yerdən şırım-şırım* (z.) *çatlamış sal şüşəsidir*. M.İbrahimov.

**ŞIRINQA** [*yun.*] b a x **şpris**.

**ŞIRMANMA** "Şırmanmaq"dan *f.is.*

**ŞIRMANMAQ** *f. məh.* Yaxına gəlmək, qucaqlamaq, boynuna sərilmək. *Uşaq anasına şırmandı.*

**ŞIRNAQ** *is.* Nazik su axını; fəvvarə. *Quyunu su şırnağı ilə yumaq. – On-on beş metr uzunluğunda güclü su şırnağı .. dağı ovub dağıdırdı.* Ə.Sadıq.

**ŞIRP** *zərf dan.* O saat, dərhal, birdən. *Şırp qapı açıldı.* – [Yəhya Kamal] *Hacının evi yanına çatmamışdı ki, şırp dayandı.* Mir Cəlal.

**ŞIRPAŞIRP** *zərf* Tez-tez, ara vermədən, qızğın. *Şırpaşırp iş görmək.* – [Usta:] *Başmaqçılar da hamısı işləyirlər. Şırpaşırp çust tikirlər.* Ə.Əbülhəsən.

**ŞIRPILTI** b a x **şappıltı**. *Əfruz bacının gözləri axdı, şırpıltı ilə döşəməyə düşdü*. S.Rəhimov.

**ŞIRRAN** *is.* Şəlalə. *Xatun .. vedrəni götürüb, dağdağan dibindəki şırrana tərəf suya yollandı.* S.Rəhimov.

**ŞIR-ŞIR** *təql.* 1. *is.* Bir qaydada axan, tökülən sudan və ya yağışdan hasil olan səs. // Zərf mənasında. *Səssiz dərədə bərq vurar şır-şır axan su*. A.Səhhət. *Yenə baş götürüb oynayır həyat; Axır şırıl-şırıl şır-şır bulaqlar.* S.Vurğun. *Yağış bütün şiddətilə yağır, şır-şır şırıldayırdı*. M.Hüseyn.

2. B a x **şırran**.

**ŞIRTILDAMA** "Şırtıldamaq"dan *f.is.*

**ŞIRTILDAMAQ** *f.* Şırtıltı səsi çıxartmaq. [Şərifzadənin] *ikinci qamçı qulağının dibində şırtıldadı*. M.Hüseyn.

**ŞIRTILTI** *is.* Qamçı, yaxud nazik çubuqla vurduqda çıxan səs.

**ŞIRVANMAQ** *f.* 1. Nəvaziş göstərmək.

2. Yalmanmaq (itlərdə). *İt sahibinə şıvranırdı.* // Quyruq bulamaq.

**ŞİBİD** *is. bot.* Xalq təbabətində dərman kimi işlənən çətirçiçək fəsiləsindən xoşiyli bitki.

**ŞİBLÉT** [*alm.* Stufelette] Qaytanlı kişi botinkası. [Heybət] *bəzən yanı rezinli jığ-jığ şiblet də geyərdi, xoşuna gəlməyən adamların kürəyinin arasını "sığallamaq" üçün əlində daima tatarı gəzdirərdi*. H.Sarabski.

**ŞİBLETLİ** *sif.* Ayağında şiblet olan, şiblet geymiş.

**ŞİBYƏ** *is. bot.* Göllərin, hovuzların kənarında, daşların, ağac gövdələrinin üzərində bitən çiçəksiz çoxillik bitki.

**ŞİDDƏT** *is.* [*ər.*] Qüvvət, güc, kəskinlik, sərtlik. *Yaz gəldi, bahar oldu, qışın şiddəti*

*getdi; Qar bitdi, külək yatdı, soyuq axıra yetdi.* A.Səhhət. [Mehriban] *acılarının şiddətindən çapalarkən* .. [Zeynalı] *görmək və onun iztirablarından təsəlli almaq istərdi*. S.Hüseyn. // Artıqlıq, güclülük, şiddətlilik. *Böyükxanım şiddəti-cəhalətdən bu sözlərə qurumuş qalmış*(*dı*). M.S.Ordubadi. ◻ **Şiddət etmək (eləmək, göstərmək)** – get-gedə artmaq, güclənmək, qüvvətlənmək, sərtləşmək, kəskinləşmək. *Derlər ki, ağlama mənə hicrani-yardən; Eşqim bu pənddən eləyib şiddət, ağlaram.* S.Ə.Şirvani. *Naxoşluq getdikcə şiddət etdi. Axırı Şaban sərsəm halətinə gəldi.* Ə.Haqverdiyev.

**ŞİDDƏTLƏ** *zərf* Bərk, güclü, çox sərt, qüvvətlə, şiddət göstərərək. *Külək şiddətlə əsirdi. – Bir az əqdəm başlamış qar şiddətlə yağırdı.* T.Ş.Simurq. *Bayırda şiddətlə göy guruldadı, şimşək parıldadı.* İ.Əfəndiyev.

**ŞİDDƏTLƏNDİRİLMƏ** "Şiddətləndirilmək"dən *f.is.*

**ŞİDDƏTLƏNDİRİLMƏK** *məch.* Daha da (getdikcə) qüvvətləndirilmək, gücləndirilmək, sərtləndirilmək; gücü, təsiri artırılmaq.

**ŞİDDƏTLƏNDİRMƏ** "Şiddətləndirmək"-dən *f.is.*

**ŞİDDƏTLƏNDİRMƏK** *f.* Gücləndirmək, qüvvətləndirmək; şiddətini, gücünü, təsirini daha da artırmaq. [Mirzə Şəfi] *əl-qolunu ölçərək ifadəsini şiddətləndirdi*. Mir Cəlal.

**ŞİDDƏTLƏNMƏ** "Şiddətlənmək"dən *f.is.*

**ŞİDDƏTLƏNMƏK** *f.* Şiddəti, gücü, qüvvəsi, təsiri daha da artmaq, güclənmək; daha da sərtləşmək, qızışmaq. *Axşamdan yağan yağış səhərə yaxın daha da şiddətləndi.* – [Qəhrəman:] *Ataş getdikcə şiddətlənir və vəziyyətin ciddiliyini andırırdı.* H.Nəzərli. *Hava getdikcə şiddətlənən küləyin vıyıltısı ilə və dənizin səslərinə qarışan quş səsləri ilə dolurdu.* M.Rzaquluzadə.

**ŞİDDƏTLİ** *sif.* Çox güclü, çox qüvvətli; dəhşətli. [Əsgər:] *Mədəndə şiddətli bir yanğın vardı*. M.Hüseyn. [Qəhrəman:] *İkinci gün şəhərdə olduqca şiddətli bir vuruşma gedirdi*. H.Nəzərli. // Eyni mənada təbiət hadisələri haqqında. *Göyün üzünü qar havasına məxsus bir tutqunluq bürümüş, şiddətli küləklə qar yağırdı*. S.Hüseyn. *Bu il şiddətli bir qış gəldi*. Ə.Məmmədxanlı.

**ŞİƏ** *is.* [*ər.*] *din.* İslamiyyətdə ayrıca bir cərəyan təşkil edən məzhəb.

**ŞİƏLİK** *is. din.* Şiə məzhəbinə mənsubiyyət. *Arvadlar arasında danışılırdı ki, bir ingilis mollası şiəliyi qəbul edib adını da dəyişib* "*Mirzə Kamil*" *qoymuşdur*. Qantəmir.

**ŞİFAHİ** *sif.* [*ər.*] Yazı ilə deyil, dil ilə; dilcavabı, ağızdan (*yazılı* əksi). *Şifahi imtahan. Şifahi nitq. – Əlibəy haqqında şifahi və ya yazılı danışıqların neçə illik tarixi vardı.* Mir Cəlal.

◊ **Şifahi ədəbiyyat** – bax **folklor** 1-ci mənada. *Xalq mahnıları da şifahi ədəbiyyat kimi nəsildən-nəslə keçərək xalq həyatındakı əhəmiyyətli tarixi hadisələri .. əks etdirir.* Ə.Bədəlbəyli.

**ŞİFER** [*alm.* Schiefer] 1. Qara və ya kül rəngli gilli şist.

2. Gildən və ya asbest-sementdən plitka şəklində hazırlanan dam örtüyü. *Uzun və geniş bir binanın şiferlə örtülmüş taxtapuşu altında çoxlu traktor, kombayn vardı.* M.İbrahimov. *Cəmi dörd-beş evin taxtapuşuna şifer vurulmuşdu.* İ.Əfəndiyev.

**ŞİFERLİ** *sif.* 1. Damına şifer vurulmuş, damı şiferlə örtülmüş. *Şiferli bina. – Şiferli damlardan qalxan boz tüstülər küləksiz havada yuxarı millənir, göyün bir qatında əriyib yox olurdu*. B.Bayramov.

2. Tərkibində şifer (1-ci mənada) olan.

**ŞİFÓN** [*fr.* shiffon] Nazik pambıq və ya ipək parça. *Güllü şifon. Saya şifon. – Şifon çox nazik və seyrək olur, sadə üsul ilə toxunur, qadın paltarlığı və koftalar üçün işlənir.* A.Quliyev. // Bu parçadan tikilmiş. *Şifon paltar.*

**ŞİFONER** [*fr.* chiffonier] Paltar, dəyişək və s. saxlanmaq üçün şkaf. *Aynalı şifoner. İkilaylı şifoner. – İndi Azərbaycan kəndlisinin evində şifoner, tül pərdələr görürsən.* İ.Əfəndiyev. *Birdən Maralın gözü şifoner aynasında öz əksinə sataşdı.* Ə.Əbülhəsən.

**ŞİFR** [*fr.* shiffre, əsli *ər.* sifir] 1. Gizli yazı üçün şərti işarələr sistemi.

2. Kitabların, yazıların, əlyazmalarının və s.-nin saxlandığı yeri göstərən şərti işarə.

**ŞİFRÇİ** *is.* Şifrləyən və şifri açan adam.

**ŞİFRLƏMƏ** "Şifrləmək"dən *f.is.*

**ŞİFRLƏMƏK** *f.* Şifrlə yazmaq.

**ŞİFRLƏNMƏ** "Şifrlənmək"dən *f.is.*

**ŞİFRLƏNMƏK** *məch.* Şifrlə yazılmaq.

**ŞİFRLƏNMİŞ** *f.sif.* Şifrlə yazılmış, gizli işarələrlə (xətlə) yazılmış.

**ŞİFRLƏYİCİ** bax **şifrçi**.

**ŞİFRLİ** *sif.* Şifrlə yazılmış. *Şifrli məktub. – Teleqramlar şifrli olduğu üçün bir şey anlaşılmırdı*. M.S.Ordubadi.

**ŞİFROQRAM** [*fr.* shiffre və *yun.* gramma] Şifrlə verilən teleqram, şifrli teleqram.

**ŞİXTA** *is.* [*alm.*] Koks almaq üçün müxtəlif metallardan ibarət kütlə.

**ŞİKAR** *is.* [*fars.*] Ov. *Cümə bekar, şənbə şikar*. (Məsəl). [Kərim babanın] *indi belə fikri-zikri daima seyrü səfada, ovda və şikarda idi.* A.Şaiq. *Bir yay aldım çıxmaq üçün şikarə; Tuş gəldim bir ahugözlü nigarə.* M.Müşfiq. ☐ **Şikar etmək (eyləmək)** – ovlamaq. *Şikar edib, tutdum bir şux tərlanı*. "Koroğlu". *Açdı siçanlara pişik dəstini; Beş siçanı eylədi zalim şikar*. S.Ə.Şirvani. **Şikara çıxmaq (getmək)** – ova çıxmaq, ova getmək. [Şirin:] *Nurcahan qarı, axirətsiz, nə tez xam yerə şikara çıxmısan?* N.Vəzirov. *Tez-tez şikara çıxmağı vərdişt etmiş şahin, indi bağlanmaqda qaldığından çox bərk darıxır, iki gün olardı ki, o, dimdiyini ətə də vurmurdu*. S.Rəhimov.

2. Ovlanan heyvan (quş). *Aslan ağzından şikar alınmaz*. (Ata. sözü). *Boğulduqca dara düşmüş o şikar; Maral kimi dil çıxarıb hayqırar.* S.Vurğun.

3. *məc.* Hiylə, kələk yolu ilə ələkeçən, toradüşən adam haqqında. *Bir dəfə nişanladığı şikarından* [Ağa Murad bəy] *məqsədinə nail olmayınca əl çəkməzdi*. T.Ş.Simurq. *Araq öz işini görmüşdü. Şikarını dəhşətli caynaqlarına almışdı.* İ.Musabəyov. [Beşaçılanlı adam:] *Şikarı əldən çıxarmaq olar? Di, tez olun.* Mir Cəlal.

**ŞİKARÇI** *is.* Ovçu. *Xanın sağında-solunda düzülən yasavullar, .. yedəklərində tazı-tula gedən şikarçılar, nökərlər böyük bir yarımdairə təşkil etmişdilər*. M.Rzaquluzadə.

**ŞİKARİ** *sif.* [*fars.*] Ova məxsus, ovda işlənən. [Oğlan] *şikari papağını sol qulağına tərəf əydi.* M.Hüseyn.

**ŞİKAYƏT** *is.* [*ər.*] 1. Öz halından və ya başına gələn bir dərd və acıdan ah-zar etmə; məmnuniyyətsizliyini izhar etmə; giley. *İllər ayrısıyam, gəl qucaqlaşaq; Sevdiyim, şikayət zamanı deyil*. Q.Zakir. *Ata-anasını görcək qız həyatından şikayətə başlardı*. H.Sarabski. *Bu nə şikayətdir, bu nə nalədir?* B.Vahabzadə. ☐ **Şikayət etmək (eləmək)** – narazılığını, məmnunsuzluğunu bildirmək, gileylənmək, ah-zar etmək. X*əstəliyindən şikayət etmək. – Şikayət eyləmə, biganədən səfa gəlməz; Nə gəlsə başına, ey xəstə, aşinadəndir.* S.Ə.Şirvani. [Mirzağa] *hər zaman şikayət edər, keçmiş günləri xatırlar, onların geri qayıtmasını arzu edərdi.* S.Hüseyn.

2. Birinin haqsızlığı və düzgün olmayan hərəkəti barəsində rəsmi şəkildə verilən məlumat, ərizə. [Qasıməli:] *Xala, qlava Xudayar bəyin şikayətinə görə oğlun Vəliqulunu tutub atdı dama*. C.Məmmədquluzadə. ☐ **Şikayət etmək** – 1) birinin özü barəsində edilən haqsızlıq haqqında rəsmi məlumat vermək. *Kimin İskəndər bəyin əlindən hökumətə şikayət etməyə cürəti vardı?* Ə.Haqverdiyev; 2) şikayətlənmək. *Birindən şikayət edəsən əgər; Danışmağa qoymaz, sözünü kəsər.* Q.Zakir.

**ŞİKAYƏTCİL** *sif.* Şikayət bildirən, həmişə şikayət edən, narazı. [Dürdanə] *qızının saçını sinəsindən topladı, kəlağayısını başına çəkdi, şikayətcil* (z.) *əlavə etdi.* Ə.Əbülhəsən. *Öz stolunun arxasında oturmuş Şəmistan çox danışan, şikayətcil ferma müdirlərinin sözlərindən daxilən narahat olsa da, çınqırını çıxarmır*(*dı*).. İ.Hüseynov.

**ŞİKAYƏTÇİ** *sif.* və *is.* Şikayət edən, şikayətə gələn. [Dilşad:] *Ev dönəcək divanxanaya, şikayətçinin biri gedib o biri gələcək.* M.Süleymanov.

**ŞİKAYƏTKAR** *sif.* [*ər.* şikayət və *fars.* ...kar] *köhn.* Şikayət edən, şikayətçi, şikayət mahiyyətində olan. *Şirəli dayısının şikayətkar danışığını eşidərkən təəccübləndi*. M.Hüseyn. // *məc.* Kədərli, yanıqlı, iniltili. *Qocanın otağından şikayətkar bir tar təranəsi gəldi*. İ.Əfəndiyev.

**ŞİKAYƏTLƏNMƏ** "Şikayətlənmək"dən *f.is. Rüstəm kişini həmişə qüvvətli və dönməz görməyə alışmış Səkinə şikayətlənməsinə dözə bilmədi.* M.İbrahimov.

**ŞİKAYƏTLƏNMƏK** *f.* Halından, vəziyyətindən, taleyindən və s.-dən şikayət etmək,

məmnunsuzluğunu bildirmək. *İzzətin səs-küyündən şikayətlənən bu ev indi çıraqsız, zülmət bir dama bənzəyirdi*. Mir Cəlal. // Şikayət etmək, gileylənmək. [Hacı Mirzağa] *Məşədi Kazım ağadan şikayətləndi.* M.S.Ordubadi.

**ŞİKAYƏTLİ** *sif.* Şikayət ifadə edən, dərdli, iniltili. // Məc. mənada. [Qəhrəman:] *Kənarda buzlu ruzgar şikayətli bir yaralı heyvan iniltisi ilə telefon tellərinə toxunur və uğuldayırdı.* H.Nəzərli. [Yaşar] *zorla çəkmək istəyəndə çəpiş şikayətli bir səslə mələdi*. Mir Cəlal.

**ŞİKAYƏTNAMƏ** *is.* [*ər.* şikayət və *fars.* ...namə] Yazılı şikayət.

**ŞİKƏNCƏ** b a x **işgəncə**.

**ŞİKƏST** *sif.* [*fars.*] 1. Bədənin hər hansı bir üzvündən məhrum olmuş və ya hər hansı bir səbəbə görə onu itirmiş; əlil. *Uşaq anadangəlmə şikəst* (z.) *doğulmuşdur*. *Şikəst oğlan. Şikəst qoca. – Əlbəttə, əzadan ki bir zad əskik olsa, şikəst hökmündədir.* C.Məmmədquluzadə. [Hacı Bayram:] *Onu bil ki, sənin şikəst atana, qoca anana rəhmim gəlib, istəmişəm, sizə bir qədər çörək verim*. Ə.Haqverdiyev. *Qocanın isə bu şikəst qızdan başqa dünyada heç kimi yoxdur*. Ə.Məmmədxanlı. // İs. mənasında. *Müharibə şikəstləri. Şikəstlərə kömək.* ◻ **Şikəst etmək (eyləmək)** – 1) bədən üzvlərindən birini sındırmaq, qırmaq, zədələmək. *Səng şikəst eylədi balü pərim; Banlamağın hasilini anladım.* M.Ə.Sabir. [Hambal:] *Məşədi, Allah qüvvət versin, amma belimi şikəst eylərsən*. Ü.Hacıbəyov. [Sərvinaz:] *Necə qıydın, o cür gözəl atı şikəst elədin?* İ.Əfəndiyev; 2) *məc.* Korlamaq, xarab etmək, pozmaq. *O kəslər ki, müəllimlik kimi .. xidməti tərk edib, qeyri peşə dalısınca gediblər, mənəviyyat cəhətincə öz əhdü peymanlarını şikəst ediblər.* F.Köçərli; 3) *məc.* Müharibədə məğlub etmək. *Düşmənin qoşununu şikəst etmək.* **Şikəst olmaq (tapmaq)** – 1) xəstəlikdən və ya başqa bir səbəbdən bədən üzvlərindən birini itirmək və ya sıradan çıxarmaq; əlil olmaq. *Müharibədə ayağından şikəst oldu*. – [Gülbəniz:] *Buruqda döşəmə və körpü həmişə palçığın içində olur. Fəhlə sürüşüb şikəst ola bilər*. M.Süleymanov; 2) *məc.* Xarab olmaq, korlanmaq, pozulmaq, nöqsanlı olmaq. *Əgər şerim şikəst olsa, mənə etmə məlamət, kim; Şikəstə söz bəyan etmək şikəst təbə mədyundur*. Heyran xanım; 3) *məc.* Müharibədə məğlub olmaq, basılmaq, sınmaq, pozulmaq. *Ona binaən Yusif şahın həvaxahları şikəst tapıb, hər kəs bir növ ilə başın mərəkədən qıraq çəkdi.* M.F.Axundzadə.

2. *məc.* Sınıq, nöqsanlı. *Stolun bir qıçı şikəstdir*.

**ŞİKƏSTEYİ-FARS** *is.* [*fars.*] *mus*. Azərbaycan klassik muğamlarından birinin adı. *Sərvər şikəsteyi-fars oxuyur.* Ü.Hacıbəyov. *Çalğıçılar şikəsteyi-farsa keçəndə Cavad hövlnak yerindən qalxıb qışqırdı: – Dayan!* Ə.Haqverdiyev.

**ŞİKƏSTƏ** [*fars.*] 1. Segah məqamında zərbli muğam. *Sürü-sürü qoyunları çoban yamacda otladır; Alır ələ papağını, oxur şikəstə, fit çalır.* A.Səhhət. *Həzin şikəstə oxuması Gülzarın fikrini dağıtmaq əvəzinə daha da onu qəhər və yas içində boğurdu.* T.Ş.Simurq. *İçi adamla dolu qayıqlarda xanəndələr şikəstə oxuyurdular*. Ə.Məmmədxanlı.

2. *sif. məc. klas.* Sınıq, qırıq, qırılmış, sınmış. *İntizarın mən çakirəm neyvəstə; Könül pərişandır, xatir şikəstə*. M.V.Vidadi. *Sınıq səbudə su tutmaz qərar, mey durmaz; Şikəstə könlümə məhvəm ki, qan ilən doludur.* Q.Təbrizi. [Cavan sevgilisinə:] *Nə oldu? Söylə, neçin böylə bivəfa çıxdın? Şikəstə könlümü, bilməm, neçin yaxıb yıxdın?* H.Cavid. ◻ **Şikəstə etmək** *klas.* – sındırmaq, qırmaq, üzmək. *Etmə şikəstə Seyyidi, ey badəxar, xar; Etsin sənə həmişə bu əhli-dua, dua.* S.Ə.Şirvani.

3. *sif. məc.* Qəlbi qırılmış, qəlbi yaralı, ürəyi sınmış. *Şikəstə Zakirəm, sevmişdim səni; Atəşi-fəraqə yandırdın məni.* Q.Zakir. *Hicran tüccariyəm, qəm şikəstəsi; Axtarıram bu dünyanı sini-sin*. Aşıq Ələsgər.

4. *is.* Fars yazısında işlədilən, sürətlə yazılan yazı xətlərindən birinin adı. *Şikəstə xətti.*

**ŞİKƏSTƏDİL** *sif.* [*fars.*] *klas.* Ürəyi sınmış, qəlbi qırılmış, incik, kədərli, incimiş. [Həcər xanım:] *..Zöhrəni elə şikəstədil* (z.) *gördükdə ürəyim paralanır*. S.S.Axundov.

**ŞİKƏSTƏXATİR** *sif.* [*fars.* şikəstə və *ər.* xatir] *klas.* Qəlbi sınmış, ürəyi sınmış, qəlbiqırıq, incik. *Sənsiz mən idim şikəstəxatir; Yüz şükr, sənə yetişdim axir.* Füzuli.

**ŞİKƏSTƏNƏFS** *sif.* [*fars.* şikəstə və *ər.* nəfs] Tələbkar olmayan, sadə təbiətli, təvazökar. *..Qənaət söhbəti də düşəndə yenə dirsəyimin gücü ilə bir elə gözəl-gözəl sözlər danışım və elə gözəl-gözəl sözlər yazım və elə hesablar verim ki, hamı desin: – Bu adam nə həqirdir, nə şikəstənəfsdir*. C.Məmmədquluzadə.

**ŞİKƏSTƏNƏFSLİK** *is.* Təvazökarlıq, təbiətcə sadəlik, tələbkar olmama. ☐ **Şikəstənəfslik etmək** – təvazökarlıq etmək, sadəlik, təvazö göstərmək.

**ŞİKƏSTLİK** *is.* 1. Şikəst adamın və ya heyvanın halı, şikəst olma, əlillik. [Usta:] *Şükür ki, şikəstlik də olmadı.* Mir Cəlal.

2. *məc.* Sınıqlıq, pozuqluq, uğursuzluq. *Qardaş, nə olub, genə belə qəm dəryasına qərq olubsan? Ticarətində nə şikəstlik var?* (Nağıl).

**ŞİKVƏ** [*ər.*] *klas.* Şikayət. İgidlər *könlünə şikvə gətirməz; Necə dağdır, quzeyində qar olmaz.* Qurbani. *İstərəm ki, varam yarın kuyinə; Şikvə edəm qəmi-pünhan əlindən.* Q.Zakir. *Nə ki var, dinlənildi şikvası; Yerinə gəldi hər təmənnası.* M.S.Ordubadi.

**ŞİL** *sif.* və *is.* [*fars.*] Çolaq, qolsuz, əlsiz-ayaqsız, əlil. [Yusif Sərrac:] *Dullara və yetimlərə və şillərə və karlara ianət və himayət göstərilsin.* M.F.Axundzadə. [Gülçöhrə:] [Arşınmalçı] *bilirəm ki, şil deyil, kor deyil, keçəl deyil, sifəti də xoşuma gəldi.* Ü.Hacıbəyov.

◊ **Şil olmuş, şil olasan!** – qarğış, nifrin ifadəsi. *Çernil, qrafit, ruçka, karandaş; İcad edəni olaydı şil, kaş!* M.Ə.Sabir. *Lal olsun hiyləgər danışan dilin! Şil olsun əllərin, bükülsün belin!* Aşıq Hüseyn.

**ŞİLƏ¹** *is.* Qatı düyü şorbası. *Nə yemisən turşulu şilə*. (Ata. sözü). *Elədir, plov gərək abırlı olsun. Yoxsa keçəl plovdan nə çıxar? Onda adına şilə deyərlər.* S.Rəhimov.

**ŞİLƏ²** *is.* Qırmızırəngli sadə pambıq parça; bez. *Bazarın bir küncündə tikilmiş dükanın içində qədəkdən, bezdən, şilədən, alçaq çitlərdən tökülübdür.* M.F.Axundzadə. *Çayçı dükanında divarın dibində 50 santimetr hündürlüyündə, 75 santimetr enliyində dövrə skamya olardı. Onun qabağı qırmızı şilə ilə örtülü olardı*. H.Sarabski. *Veys özü izah etdi: – Bu qırmızı şiləni Həmzənin dükanından götürmüşəm*. Ə.Əbülhəsən.

**ŞİLƏMƏ** "Şiləmək"dən *f.is.*

**ŞİLƏMƏK** *f. dan.* Dalbadal vurmaq, gülləyə tutmaq. *Abdulla onları gülləyə basdı. Onlar da kəndi şiləməyə başladılar.* Ə.Vəliyev.

**ŞİLƏPLOV** *is.* Südlü aş, südaşı.

**ŞİLƏYİ** *sif. köhn.* Şilədən tikilmiş. *Köhnə çarqat, köhnə ağ çit arxalıq və köhnə solmuş şiləyi dizlik – övrətin libası budur.* C.Məmmədquluzadə.

**ŞİLGİR** *is. bot.* Gilasaoxşar yeməli, yabanı meyvəsi olan kol bitkisi.

**ŞİLGİRLİK** *is.* Şilgir kolları bitmiş yer. [İlyas:] *Tərlan gah kol topaları üzərindən sıçrayır, gah qabağımıza çıxan şilgirliyi döşüylə yarıb keçir*(*di*).. Ə.Məmmədxanlı.

**ŞİL-KÜT: şil-küt etmək (eləmək)** – bərk döyüb əzişdirmək, qol-qabırğasını sındırmaq, şikəst eləmək, çolaq eləmək. [Hacı Qara:] *Ta mən sizin ikinizi də şil-küt etməsəm, ölkə sizin əlinizdən dincəlməz*. M.F.Axundzadə. [Günəş Araza:] *Mən arvadlığımla bunların hər üçünü şil-küt edib yola salaram.* A.Şaiq. **Şil-küt olmaq** – bərk döyülməkdən şikəst olmaq, bədəni əzik-əzik olmaq, hərəkətsiz hala düşmək; // *məc.* Sınıq-sınıq olmaq, qırılmaq, sınıb tökülmək. *Şil-küt olmuş ağaclar yaralarını sağaldır, şivləyirdi*. S.Rəhimov.

**ŞİLLƏ** b a x **sillə**. [Dərviş:] *Ruqiyyəni güclə itələyib, bir şillə üzünə vurdum.* A.Divanbəyoğlu.

**ŞİLLƏLƏMƏ** "Şilləmək"dən *f.is.*

**ŞİLLƏLƏMƏK** 1. B a x **silləmək**. *Lalə Şirmayını yalnız bir dəfə özündən kiçik bir qızı döyüb ağlatdığı üçün bərk şilləmişdi.* M.Hüseyn. *Salatın anasının titrədiyini və birdən geri dönüb gəlini şillədiyini gördü.* İ.Şıxlı.

2. Əldolusu, ovuclayıb götürmək. *Ocaqqulunun arvadı xörəyi çəkib gətirdi, koxa şilləyib plovu ötürdü.* S.Rəhimov.

**ŞİLLİK** *is.* Şil adamın halı, çolaqlıq, əlillik.

**ŞİLLİNQ** [*ing.* shilling] Funt-sterlinqin $^{1}/_{20}$-nə bərabər ingilis pulu.

**ŞİLTƏNGLİK** b a x **şitəngilik**. [Gülçöhrə] *şiltənglik başlayıb yenə bacısının tərəfinə əlini uzadır*. M.F.Axundzadə.

**ŞİLTƏ-ŞİLTƏ** *zərf* Parça-parça, cırıq-cırıq, yıpranmış halda. □ **Şiltə-şiltə olmaq** – parça-parça olmaq, tikə-tikə olmaq, cırıq-cırıq olmaq, yıpranmaq. [Humayın] *papağına dörd tolamaz da birdən dəydiyi üçün papağın sağanağı şiltə-şiltə oldu.* Ə.Vəliyev.

**ŞİMAL** *is.* [*ər.*] Dünyanın cənuba əks olan cəhəti. *Kompasın əqrəbi şimalı göstərir.* // Cənuba əks olan səmt, cəhət. *Həm buludlar gedir şimala sarı; Gün də qalxır yavaş-yavaş yuxarı.* A.Səhhət.

2. Yer kürəsinin soyuq və mötədil soyuq iqlim zonasında yerləşən sahəsi. *Şimal havası. – Uzaq şimal tayqasında ayaq xizəyində quş kimi süzən bir gənc uca bir küknarın dibində bir anlığa durub tüfəngini çiynindən aşırır.* M.Rzaquluzadə. // (Böyük hərflə). *Avropa və Asiya qitələrinin lap qurtaracağı boyunca soyuq iqlim zonasında yerləşən ərazi, habelə Yer kürəsinin ona bitişik olan qütb sahəsi; Arktika. Şimal xalqları. Şimal ekspedisiyası.*

**ŞİMALİ** *sif.* [*ər.*] Şimala mənsub, şimala aid; şimalda, şimal tərəfdə olan. *Şimali Avropa. Şimali Afrika.*

**ŞİMAL-QƏRB** *is.* Üfüqün şimalla qərb arasındakı hissəsi, cəhəti. *Şimal-qərb istiqaməti. Şimal-qərb küləyi.* // Ölkənin, dövlətin, qitənin bu istiqamətdə, bu səmtdə yerləşən yerləri, hissəsi. *Qafqazın şimal-qərbi. Orta Asiyanın şimal-qərbi.*

**ŞİMALLI** *sif.* Şimal ölkələrinin birində doğulub yaşayan. // İs. mənasında. *Şimallıların adət və ənənələri.*

**ŞİMAL-ŞƏRQ** *is.* Üfüqün şimalla şərq arasındakı hissəsi, səmti. *Şimal-şərqə tərəf istiqamət almaq.* // Ölkənin, dövlətin, qitənin bu istiqamətdə yerləşən yerləri, hissəsi. *Avropanın şimal-şərqi. Afrikanın şimal-şərqi.*

**ŞİMALTÜLKÜSÜ** *is. zool.* Şimalda yaşayan, qiymətli xəzi olan tülkü cinsi.

**ŞİMPANZÉ** [*fr.* chimpanze] Tropik Afrika meşələrində yaşayan insanabənzər meymun.

**ŞİMŞƏK** *is.* İldırım. *Payızda şimşək nadir bir hadisə idi.* M.Hüseyn. *..Bayırda şiddətlə göy guruldadı, şimşək parladı.* İ.Əfəndiyev.

**ŞİMŞƏKLİ** *sif.* İldırımlı. *Dağ kimi dalğaların; Qatarını sökək! Şimşəkli bulud kimi; Düşmən üstünə çökək.* R.Rza.

**ŞİMŞİRƏKLİ** b a x **şimşəkli**. *Bahar olsun fırtınalı; Şimşirəkli, gurultulu; Hər zərbəsi qüdrət dolu; hər parçası həyat dolu.* R.Rza.

**ŞİN** *is.* [*alm.* Schine] 1. Təkər qurşağı; təkərin üstünə taxılan dəmir çənbər. *Təkərin dəmir şini xırda daşları əzib qıcırdadı.* İ.Şıxlı. // Avtomobil təkərinin, içi hava ilə doldurulan rezin çənbəri. *Şinlər* [avtomobilin] *sərbəst gedişini təmin etmək və hərəkat hissələrini tez yeyilmədən qorumaq üçündür.* Ə.Əliyev.

2. *tib.* Bədənin (çox vaxt qolun, qıçın) bintlənmiş yerinin tərpənməməsi üçün sarğının altından qoyulan lövhəcik.

**ŞİNEL** [*rus.*] Xüsusi biçimdə tikilmiş əsgəri qış paltosu. *Heybət ocağın qırağında uzandı. Sırıqlı pencəyinin üstündən şinelini saldı.* M.Hüseyn. *Mən də yorulmuşdum, şineli açıb yarısını yerə saldım.* H.Nəzərli.

**ŞİNELLİ** *sif.* Əynində şinel olan, şinel geymiş. *Qarşımda ucaboylu, uzun əsgər şinelli bir kişi dururdu.* C.Cabbarlı. *Tahirlə Qulam müəllimin söhbətinə fikir verən müsahiblər, gündüzkü əzinik şinelli və uzunboğaz çəkməli adama baxırdılar.* S.Rəhimov.

**ŞİNƏBUB** b a x **şanapipik**. *Dinləməyə başladıq; Bağçada "hop-hop" deyən; Şinəbubun səsini.* B.Vahabzadə.

**ŞİNGİLƏ** *is. bot.* Kauçuklu bitki.

**ŞİNGİLİM** *is. bot.* Xırda, qırmızı toxumları olan kol – bitki.

**ŞİNLƏMƏ** "Şinləmək"dən *f.is.*

**ŞİNLƏMƏK** *f.* Şin çəkmək. *Təkərləri şinləmək.*

**ŞİNLİ** *sif.* Şin çəkilmiş, şini olan. *Rezin şinli fayton.*

**ŞİPŞİRİN** *sif.* Çox şirin, bal kimi şirin. *Şipşirin üzüm. Şipşirin armud.*

**ŞİR**[1] *is.* [*fars.*] 1. Pişiklər fəsiləsindən qısa, sarımtıl tüklü, iri gövdəli məməli yırtıcı heyvan; aslan. *Əlbir olub bir ayı bir şir ilə; Ovladılar dovşanı tədbir ilə.* A.Səhhət.

2. *məc.* Çox qoçaq, qorxmaz, qüvvətli adam haqqında. *Qoçaqdı, şirdi balam; Qiblədi, pirdi balam; Gəl, fələk, qıyma mənə; Yazığam, birdi balam.* (Bayatı). □ **Şir kimi** – aslan kimi, qorxmadan, igidcəsinə, qəhrəmancasına. [Gülnar:] *Nə var, lap yaxşıdır, şir kimi sağdır; İndi ova gedib, bu saat gələr.* S.Vurğun. *De hansı qəhrəman, hansı koman-*

*dan; Şir kimi cəbhələr yardığı zaman; Qəşş edib ayağı yerdən üzüldü?* B.Vahabzadə. **Şirə dönmək** – qızmaq, ürəklənmək, cəsarətlənmək. *Həlim, mehriban, təmizürəkli Gülbadam birdən-birə şirə döndü.* N.Nərimanov.

**ŞİR²** *is.* Saxsı qabların üzünə çəkilən şüşəyəoxşar parlaq ərinti.

**ŞİRANƏ** *zərf* [*fars.*] 1. Şir kimi, aslan kimi. *Şiri şiranə tutarlar.* (Ata. sözü).

2. *məc.* Qəhrəmancasına, şücaətlə, cəsarətlə. *Ta müqabildə duraq şiranə; Yaşamaqçın çalışaq mərdanə.* A.Səhhət.

**ŞİRAZİ** *sif.* [*fars.* coğr. addan] Şirazda qayrılmış, Şiraz səpkisində hazırlanmış. *Şirazi kürk. – Xidmətçi qapını açaraq şirazi qəlyanı gətirdi və hələ də qəzetləri eşələyən Hikmət İsfəhaninin qabağına qoydu.* M.İbrahimov. [Mərsiyəxan] *qara şirazi müştüyünün ucuna taxdığı papirosun uzanan külünü külqabına boşaltdı.* Qantəmir.

**ŞİRBİRİNC** *is.* [*fars.*] Südlüsıyıq. *Bir az vaxtdan sonra bir ədəd yaqut məcməyidə .. şirbirinc gəldi.* Ə.Haqverdiyev.

**ŞİRBİT** *is. zool.* Çəki balığının bir növü.

**ŞİRÇİ** *is.* Şir çəkən, rəngsaz.

**ŞİRÇİLİK** *is.* Şirçi sənəti, rəngsazlıq.

**ŞİRDAN** *is.* [*fars.*] Kövşəyən heyvanların ikinci mədəsi; qursaq. *Tam məhlul halına salınmış yem qursaqdan – şirdandan nazik bağırsağa keçir.*

**ŞİRƏ¹** *is.* [*fars.*] 1. Toxumalarda, hüceyrələrdə, bitki və heyvan orqanizmi boşluqlarında olan duru maddə, maye. *Mədə şirəsi.* // Bitkilərdən, çiçəklərdən sızan şirin maye. *Şirə yığmaqda idi bal arısı zəhmət ilə; Qaraquş gördü onu, söylədi çox nifrət ilə.* A.Səhhət. *Qırx gözəl qız bir anda yamaca yayılıb, ana vətənin şirəsini içmiş ətirli dağ çiçəkləri yığdılar.* M.Rzaquluzadə.

2. Meyvə suyu. *Üzüm şirəsi. Çiyələk şirəsi. – Baba isə .. üzümləri dərib gətirər, tapdalayar və şirə yığardı.* H.Sarabski.

3. *məc.* Bir şeyin məğzi, cövhəri. *O, sözünü belə başladı və Əlimərdan bəyə tərcümə eləməsini tapşırdı: – Burada oturanlar müsəlman ruhunun şirəsidir.* M.S.Ordubadi.

4. *k.t.* Sulu gübrə. *Şamama sahəsinə peyin şirəsi də vermişdi.* Ə.Əbülhəsən.

5. Yaşlıq, rütubət. *Torpağın şirəsi.*

◊ **Şirə çəkmək** *məc.* – ləzzət aparmaq, nəşə çəkmək, şəhvani zövq almaq. [Usta Həsən:] *Danışma, dur düş qabağıma, sən dişini çəkdirərsən, mən də bir az şirə çəkərəm.* Ə.Haqverdiyev. *Mirzə Mustafa çadraya bürünüb arvadların içinə məclislərdə, toylarda və təziyələrdə qarışırdı, şirə çəkirdi.* E.Sultanov. **Şirəsini sormaq** – qanını sormaq, istismar etmək. *Nə qədər ki* [mülkədarlar] *yaşayırlar, sizin şirənizi soracaqlar.* Ə.Vəliyev. **Dişində şirə qalmaq** – b a x **diş**.

**ŞİRƏ²** *is.* Xüsusi gil növü və divarlara çəkmək üçün ondan hazırlanan məhlul. *Şirə ilə evi ağartmaq. Eyvana şirə çəkmək.*

**ŞİRƏ-BORAN** *is.* Çox güclü yağış. *Çox yox, yarımca saat şirə-boran yağış yağsaydı, az qala qozalardan üzülüb yerə tökülən pambığı zay eləyə bilərdi.* M.Hüseyn. *Bayırda şiddətli göy gurultusu eşidilir. Şirə-boran yağış tökür.* İ.Əfəndiyev. // İs. mənasında. *Çox güclü, arasıkəsilməz yağış. Bayırda şirə-borandır.*

**ŞİRƏXANA** *is.* [*fars.*] *köhn.* Şirə (tiryək) çəkilən yer, tiryəkxana. *Qoqanda, Tusda hərçənd şirəxana az olmur; Və leyk Rəştdə, yəni Gilanda görməli imiş.* M.Ə.Sabir. // Şərabçı dükanı, meyxana. [Ata:] *Mənim bir pişiyim olsa, onu da Səfərə vermərəm, oruc tutmaz, namaz tanımaz, ..axşamadək .. şirəxanada oturub çaxır içir.* Ə.Haqverdiyev.

**ŞİRƏXƏK** *is.* [*fars.*] Şirə qarışıq torpaq. *Bir cürə ağrəngli torpaq vardır, şirəyə ondan qatıb süzdükdən sonra doşab turş-şirin olardı. Bu torpaqdan qatılmasa idi, doşab turş-şirin olmazdı. Onun adına şirəxək deyərdilər.* H.Sarabski.

**ŞİRƏKEŞ** *is.* [*fars.*] Tiryəkçəkən, anaşaçəkən, anaşaxor, tiryək düşkünü. *Nə bəngiyəm, nə palakeş, nə şirəkeş, nə filan..* M.Möcüz.

**ŞİRƏKEŞLİK** *is.* Tiryəkçilik, tiryəkçəkmə, anaşaxorluq, tiryək düşkünlüyü. *Şirəkeşlik yazıq kişini cavan yaşında yerə sərmiş və üç balasını yetim qoymuşdu.* Ə.Sadıq.

**ŞİRƏKİ** b a x **şirəkeş**. *Zalım oğlu Kərbəlayı şirəki də kəndə gələn divan adamlarını dördəlli qarmalayır.* S.Rəhimov.

**ŞİRƏLƏMƏ** "Şirələmək"dən *f.is.* *Şirələmə işi.*

**ŞİRƏLƏMƏK** *f.* Şirə vurmaq, şirə çəkmək, şirə ilə örtmək. *Qazıma zamanı quyuda cərəyan edən gilli məhlul onun divarlarını şirələyir.* S.Quliyev.

**ŞİRƏLƏNMƏ** "Şirələnmək"dən *f.is.*

**ŞİRƏLƏNMƏK** *f.* 1. Şirə ifraz etmək, şirə buraxmaq, şirə salmaq, sulanmaq, tam yetişmək. *Payız vaxtı bağçamızın heyvaları dəyəndə; Şaftalılar şirələnib budağını əyəndə; Xonça tutub göndərərəm sənin də öz payını.* S.Vurğun.

2. Şirə vurulmaq, şirə çəkilmək. *Divarlar tərtəmiz şirələnmişdir.*

**ŞİRƏLİ** *sif.* 1. Şirəsi olan, sulu. *Şirələ meyvə. Şirəli yem. Şirəli bitki. – Ənvər şirəli üzümdən yeyir, qırmızı yanaqları gözəllənir, qüvvəsi birə yüz artırdı.* Ə.Vəliyev. [Çəpəl:] *Arvad dediyin bal arısıdır. Şirəli çiçəyə qonar.* Mir Cəlal.

2. Şirə vurulmuş, şirə çəkilmiş, şirələnmiş. *Həyətin o biri tərəfində nazik bir daş divarla müntəzəm tikilmiş .. şirəli mətbəx, yanında isə dörd bir tərəfi əhənglənmiş toyuq hini, bəzi həyətlərdə köpək damı da görmək olardı.* H.Sarabski.

3. Şirəyə bulaşmış, şirə sürtülmüş. *Şirəli əl. Şirəli paltar. – Katib bu fikirdə ikən üstüörtülü qaloşunu ayaqlarında sürütləyən, şirəli ağ sarığı əlində sallayan Kosa .. özünü katibin üstünə atdı.* S.Rəhimov.

4. *məc.* Təravətini, məlahətini itirməmiş, gözəşirin, xoş, duzlu. *Dürdanə xanım yaşı altmışa yaxın, qədd-qamətli, hələ çox canı şirəli bir arvaddı.* Ə.Əbülhəsən.

**ŞİRƏLİK**[1] *is.* Şirə çəkmək üçün yararlı, şirə çəkməyə məxsus. *Şirəlik meyvə. Şirəlik üzüm.*

**ŞİRƏLİK**[2] *is.* Şirə çıxarılan yer, şirədən ibarət torpaq (b a x **şirə**[2]). ..[Tamam] *şirəlikdə şirə qazırdı.* Ə.Əbülhəsən.

**ŞİRƏPUS(T)** *is.* [*fars.*] *köhn.* Şirə çəkməyə məxsus tüklü dəri parçası. *Qıza bir darbalaq tuman geydirib, əlinə bir parça şirəpus verib gününü göy əsgiyə düyünlərdilər.* H.Sarabski.

**ŞİRƏYİ** *is.* Sarırəngli, girdədənəli, tezyetişən, şirin üzüm növü.

**ŞİRİ-JƏYAN** *is.* [*fars.*] Qızmış şir, qızmış aslan təşbeh məqamında işlənir. [Murtuzaqulu xan:] *Afərin, .. igidlər hər biri bir şiri-jəyan tək dava edirlər.* Ə.Haqverdiyev. *Ay baba, mən bu sözü yazdım əyan olmağa; Bakılılar and içib şiri-jəyan olmağa.* C.Cabbarlı.

**ŞİRİKLƏNMƏK** *f.* Meyillənmək. *Həvəsində olmaq. Aludə olmaq. Aludəçilik etmək.*

**ŞİRİN** *sif.* [*fars.*] 1. Ağızda şəkər, bal və s. kimi xoş tam verən; dadlı, ləzzətli (*acı* ziddi). *Şirin armud. Şirin meyvə.* – [Tapdıq] *bir stəkan şirin çay içdi.* Ə.Vəliyev. *Respublikamızda şirin nar, göy nar, mələkeş narı .. və sair qiymətli yerli nar sortları da becərilir.* İ.Axundzadə. // Şəkərlə, balla, mürəbbə və s. ilə hazırlanan. *Şirin qoğal. Şirin yeməklər.*

2. *zərf məc.* Ləzzətlə, böyük həvəslə, iştaha ilə, şirin-şirin. *..Rəna elə şirin yatmışdı ki, qulağının dibində top da atılsaydı oyanmazdı.* E.Sultanov. [Səlim] *gələrkən qonaqlar şirin yeməklə məşğul idilər.* S.Hüseyn. [Pərzad xala] *bişirdiyi xörəyin şirin yeyilməsindən bildi ki, o hər şeydə naşı olsa da, əl suyu verməkdə, aş bişirməkdə ustadır.* Mir Cəlal.

3. İçməli, içməyə yarar (su haqqında). [Növrəstə:] *Bu gün, günorta çağı su budkası açılıb, kəndə şirin bulaq suyu axacaqdır.* Ə.Haqverdiyev. // Tərkibində duz olmayan (*şor* ziddi). *Şirin su balıqları.*

4. *məc.* Xoş, səfalı, dadlı, zövqverici, ləzzətli. *Şahın ömründən ancaq iyirmi iki il keçmişdi. Məlumdur ki, bu sində həyat necə şirin və əzizdir, xüsusən ki, .. təxti-səltənətin üstündə.* M.F.Axundzadə. // *məc.* Çox qiymətli, çox əziz. [Alı:] *Həsən xan, insan üçün dünyada hər naz-nemətdən şirin şey gözdür.* "Koroğlu". [Əhməd:] *Qoyaram yolunda şirin canımı; Soraqlaşıb Qəribini taparam.* "Aşıq Qərib". *İstədi, can verdim, qədir bilmədi; O şirin canına qurban olduğum.* Ə.Cavad.

5. *məc.* Ürəyəyatan, xoşagələn, xoş. *Şirin söz. Şirin danışıq.* – [Rüstəmin] *indi də üzgözü gülür, səsi şaq-şaq şaqqıldayır, ağzından şirin və mehriban sözlər çıxırdı.* M.İbrahimov. [S.Vurğunun] *hər məclisdə şirin sözü, söhbəti vardı; Dolaşırdı nəğmələri ellər içində.* Ə.Kürçaylı. ☐ **Şirin dil** – ürəyəyatan, xoşagələn. [Şahbaz bəy:] *Necə şirin dil ilə yaxasın qıraq çəkir, dəxi niyə titrəyirsən?* M.F.Axundzadə. *Mirzə Möhsün tarixə yaxşı bələd, hafizəsi düzgün, söhbəti və dili şirin, qoca bir müəllimdir.* Qantəmir.

6. *məc.* Xoş, səfalı, fərəhli, məsud. *Şirin tələbəlik illəri. Şirin ailə həyatı. – Uşaqlıq! Nə şirin, nə təmiz, gözəl aləmsən.* Mir Cəlal. // *məc.* Qızğın, canlı, maraqlı. *Lütfəli bəy və bir neçə bəylər oturub şirin söhbət eyləyən vaxtda Nəbi içəri girir*. "Qaçaq Nəbi". *Qarı şirin söhbətlə hamının diqqətini cəlb etmişdi.* S.Qədirzadə. [Fərəc kişi:] *Şirin* (z.) *işlədiyimiz yerdə birdən-birə fısıldayıb durdu*. Q.İlkin. // *məc*. Xoşagələn, mehriban, riqqətli. [Nadir] .. *yorğan-döşəkdə yatdığını və anasının mehriban rəftar və şirin sözlərindən təsəlli tapdığını xatırladı*. B.Talıblı. *Gəncliyin qəribə xəyalları* [Nuriyəyə] *şirin vədlər verirdi*. İ.Əfəndiyev. ☐ **Şirin gəlmək** – xoş gəlmək, ləzzət vermək, ürəyə yatmaq. ..*Orada sakin olanların malı quldurlara çox şirin gəlir*. Ə.Haqverdiyev.

7. Bəzi yeməli bitkilərin adlarının tərkib hissəsi. *Şirin biyan. Şirin bibər.*

8. Çox gözəl olmadığı halda, olduqca sevimli, cazibəli görünən; qanışirin, suyuşirin. *Şirin qız. Şirin uşaq.*

◊ **Şirin cana qəsd eləmək** – 1) öldürmək. *Əyibdi qəddimi qaşların tağı; Qəsd eləyib şirin cana gözlərin*. Sarı Aşıq; 2) *zar.* Çox işləməklə, çalışmaqla özünə əziyyət, əzab vermək. [Fərəcov Yusifə:] *Şirin cana yaman qəsd eləmisən ha!* B.Bayramov. **Şirin dil tökmək, şirin dilə tutmaq** – şirin sözlərlə aldatmağa, yola gətirməyə çalışmaq. [1-ci kəndli:] *Eşidirsən, nə şirin dillər tökür?* Ə.Haqverdiyev. *Xumar* [Mehrinin] *yan-yörəsinə keçdi, şirin dilə tutdu, rəfiqəsinin boynuna sarıldı.* V.Şıxlı. **Şirin ət** – bədənin hər hansı bir yerinin yumşaq, qalın əti. *Qıçın şirin əti. Qolun şirin əti. – Qarşı-qarşıya duran iki qəbilə nümayəndələrinin sol əllərini qaldıraraq, baş barmaqlarının şirin ətini cızdılar və çıxan qanı .. yeddi daşa yaxdılar*. Çəmənzəminli. **Şirin yuxu görmək, şirin yuxuya getmək, şirin yuxuda olmaq** – xoş; rahat, ləzzətlə yatmaq mənasında. [Qaraş] *Mayanı şirin səhər yuxusundan ayıltmaq istəməyərək ehtiyatla geyinib çölə çıxdı*. M.İbrahimov. *Xasay şirin bir yuxudan ayılmış kimi geri qanrılaraq anasına tərəf baxdı*. Ə.Vəliyev. *Bülbül, fəğan etmə bu gecə yarı; Şirin yuxudadır hələ nazlı gül.* N.Rəfibəyli.

**ŞİRİNCƏ** *sif.* Bir az şirin, azca şirin, şirintəhər. // Çox şirin. *Aşıq şirin camalım; Versin şirin cam, alım. Qonşuda bir qız sevdim; Odur şirincə malım.* (Bayatı). [Kərbəlayı Tapdıq] *şirincə yuxuda idi*. Mir Cəlal.

**ŞİRİNDİL(Lİ)** *sif.* Xoşdanışan, dilişirin, gülərüzlü. *Şirindil qız.* – [Rəhim bəy] *dünyagörmüş .. naçalniklər yanında xidmət etmiş, şirindil, zərif, gödəkboylu, altmış sinnini ötmüş bir kişi idi*. Ə.Haqverdiyev.

**ŞİRİNHAL** b a x **şirintəhər**.

**ŞİRİ-NƏR** [*fars.*] 1. Erkək aslan.

2. *məc.* Təşbeh məqamında işlənir. *Mənəm şiri-nərtək meydanda gəzən; Xışm ilə düşmənin bağrını əzən.* "Koroğlu".

**ŞİRİNQOVURMA** *is.* Kişmiş, qaysı, alça qurusu və s. ilə hazırlanan xuruş. *Şirinqovurma plovla yeyilir*.

**ŞİRİNLƏNDİRMƏ** "Şirinləndirmək"dən *f.is.*

**ŞİRİNLƏNDİRMƏK** b a x **şirinləşdirmək**.

**ŞİRİNLƏŞDİRMƏ** "Şirinləşdirmək"dən *f.is.*

**ŞİRİNLƏŞDİRMƏK** *f.* Şirin etmək. *Çaya qənd salıb şirinləşdirmək. Xəmirə şəkər qatıb şirinləşdirmək.*

**ŞİRİNLƏŞMƏ** "Şirinləşmək"dən *f.is.*

**ŞİRİNLƏŞMƏK** *f.* 1. Şirin olmaq, şirin dad vermək. *Xəmirə şəkər qatıldığından şirinləşdi*.

2. Daha şirin olmaq. *Meyvələr dəyib şirinləşdi.*

3. *məc.* Sərtliyi, qabalığı atmaq, xoşsifət, şirindil olmaq. *Danışığı şirinləşib. – Bülbülün qarşısında açıl, şirinləş; Qızılgül kimi.* M.Müşfiq.

4. *məc.* Daha da qızışmaq, daha maraqlı olmaq, canlı olmaq. [Ata:] *Söhbətimiz çox şirinləşdi*. Ə.Haqverdiyev. *Söhbət şirinləşir və uzanırdı*. H.Nəzərli. *Həbib çay içir, Gözəl fındıq sındırır, söhbət həm qızışır, həm də şirinləşirdi.* Ə.Vəliyev.

**ŞİRİNLƏTMƏ** "Şirinlətmək"dən *f.is.*

**ŞİRİNLƏTMƏK** b a x **şirinləşdirmək**.

**ŞİRİNLİK** *is.* 1. Şirin şeyin halı; şirin dad; dadlılıq, ləzzətlilik. *Şanı şirinlikdən boğazı yandırır.* // Dad, ləzzət. *Şirinliyindən adam doymur.*

2. *məc.* Səmimilik, mehribanlıq. *Bu şirinlik ki, var mabeynimizdə yar ilə, Seyyid! Əgər*

*bilsə qiyamətlər qopar başına Fərhadın.* S.Ə.Şirvani. // Zövq, səfa, ləzzət. [Qüdrət] *ailə həyatının şirinliyindən doymadığını sözdə arvadına bildirməyi artıq bilib susdu.* M.Hüseyn. *Sərvinaz ona elə bir ifadə ilə baxdı ki, elə bil dayısı oğlunun öpməyində bu qədər şirinlik olduğuna təəccüb edirdi.* İ.Əfəndiyev.

3. *məc.* Zəriflik, incəlik, yapışıqlıq, ürəyəyatma. [Zeynalın] *..səsində dinləyənlər üzərinə bir musiqi təsiri buraxacaq məlahət və şirinlik yoxdu.* S.Hüseyn.

4. *məc.* Xoşluq, səmimilik. *Qızın üzündə şirinlik var.*

◊ **Şirinlik içilmək** – bax **şirni içilmək** ("**şirni**"də). *Şirinlik içilən axşam qonaqlar mübarəkbadlıq edib dağıldılar.* Mir Cəlal. **Şirinlik (şirinliyini) vermək** – şirni vermək, şirni paylamaq. *Nişanın şirinliyini vermək.* – [Səhnəbanı:] *Ələsgər, paltarın mübarək olsun; nə yaxşı da yaraşır, gərək şirinliyini verəsən.* "Aşıq Ələsgər və Səhnəbanı". **Ağız şirinliyi** – el adətincə xeyir işdə camaata paylanan, verilən şirni. [Xudayar bəy qoca kişiyə:] *Qəndi gətirmişəm qazı ağaya. Bir xeyir işimiz var. Bu da ağız şirinliyidir.* C.Məmmədquluzadə.

**ŞİRİNSÖHBƏT(Lİ)** *sif.* Danışığı, söhbəti xoş olan, xoşa gələn; söhbəti səmimi, ürəyəyatan. *Şirinsöhbət adam.* – *Teymur müəllim şirinsöhbət və xəyalpərvər bir gənc idi.* Ə.Sadıq.

**ŞİRİN-ŞİRİN** *zərf* Həvəslə, şövqlə, ləzzətlə, iştaha ilə. *Dilənçi dağarcığından bir qədər quru çörək və soğan çıxarıb Nurəddinə verdi. Nurəddin alıb şirin-şirin yeməyə başladı.* S.S.Axundov. [Ağsaqqal kişi] *şor-çörək tikəsini orduna basır, yağ-bal kimi şirin-şirin yeyirdi.* Mir Cəlal. // *sif. məc.* Şirin, xoş, dadlı. *Şirin-şirin sözlər. Şirin-şirin yuxular.* – *Məktəbdə var şərafət; Dəftərdə var lətafət; Cari olur qələmdən; Şirin-şirin hekayət.* M.Ə.Sabir. *Yusif əmi hər gecə bizə şirin-şirin nağıllar danışır, çox qəribə tapmacalar deyərdi.* A.Şaiq.

**ŞİRİNTƏHƏR** *sif.* Azca şirin dadı verən, bir az şirin, bir qədər şirin. *Şirintəhər meyvə.* – *Qabığı təmizlənmiş qozanı* (*palıd qozasını*) *3-4 gün suda saxlayırlar, bu müddət ərzində suyunu 3 dəfə dəyişirlər, .. şirintəhər olan bu qozaları əvvəlcə havada, sonra sobada qurudub üyüdürdülər.* "Elm və həyat".

**ŞİRKƏT** *is.* [*ər.*] Şəriklik əsasında ticarət və ya sənaye birliyi. *Aksionerlər şirkəti. Kredit şirkəti.* – *Fransız şirkətinin paroxodu ilə Batumiyə gizli ədəbiyyat göndərilmişdi.* M.S.Ordubadi. // Birlik, cəmiyyət. *Məşədi Əsgər tərəqqi edəndən sonra öz köhnə muzdur yoldaşlarından bir neçələrini başına yığıb, onlara əl tutmaq üçün gəmiçilik şirkəti bina qoydu.* S.M.Qənizadə. // Şəriklik, ortaqlıq.

**ŞİRLƏMƏ** "Şirləmək"dən *f.is.*

**ŞİRLƏMƏK** *f.* Üzərinə şir çəkmək. *Çini qabların üzərini şirləmək üçün çöl şpatı, kaolin, silisium ilə bərabər təbaşir və əhəngdaşı da işlədilir.* A.Quliyev. // Üstünü rəngləmək, boya ilə boyamaq.

**ŞİRLƏNMƏ** "Şirlənmək"dən *f.is.*

**ŞİRLƏNMƏK** *məch.* Üzərinə şir çəkilmək, şir vurulmaq. // Rənglənmək, boyanmaq. *..Taxta fərşlər təzə şirlənmişdi.* C.Məmmədquluzadə.

**ŞİRLİ** *sif.* Şir vurulmuş, şir çəkilmiş. [Sadıq] *içi kərə yağla dolu şirli küpəni döşəməyə qoydu.* Mir Cəlal. // Rəng vurulmuş, rənglənmiş. *Şirli qapı. Şirli divar.*

**ŞİRMA** [*alm.* Schirm] 1. Üzərinə parça və ya başqa material çəkilmiş çərçivələrdən ibarət açılıb-bükülən arakəsmə.

2. *məc.* Bir şeyi örtüb gizlətmək üçün örtü, pərdə.

**ŞİRMAYI** *is.* [*fars.* şirmahi] 1. Fil sümüyü və ya ona bənzər maddə. *Şirmayı dillərdə süzür barmaqlar; "Səadət nəğməsi" yaradır bahar.* S.Vurğun. *Minayə .. incə, uzun barmaqlarını pianonun şirmayısı tökülmüş dillərinin üstündə oynadır.* Ə.Əbülhəsən. // Sədəf. [Buğacın] *belində zərif naxışlı tirmə qurşağa taxılmış ağ şirmayı dəstəkli, qırmızı məxmər qınlı bir bıçaq var idi.* M.Rzaquluzadə.

2. *sif. məc.* Sədəf kimi, ağappaq. *Şirmayı dişlər. Şirmayı dəri.* – *Şirmayı rəngli maşının; Rulundan yapışıb; Şirmayı barmaqlı əllər; Sürür maşını küçələrlə.* N.Rəfibəyli.

**ŞİRNİ** *is.* Qənd, şəkər, konfet, nabat və s. şirin şeylər; şirniyyat, qənnadı. *Şirni almaq.*

*Şirni yemək. – Hünər heç vaxt öz əlində bu qədər şirni görməmişdi.* Mir Cəlal. *At kişmiş qoxusunu alaraq, Ayaza yaxın gəldi və şirnini onun ovucundan sümürdü.* Ə.Məmmədxanlı.

◊ **Şirni içilmək** – nişanlanmaq, üzük taxılmaq. *Bir həftə sonra şirni içildi, kəbin kəsildi, toy dəsgahı Məşədi Cavadın vəfatının ili çıxmasına qaldı.* B.Talıblı. **Şirni içmək** – nişanlamaq. [Novruzqulu:] *Kəbleyi, nə vaxt buyurursunuz, şirni içməyə gələk?* H.Sarabski. **Şirni vermək** – xoş, xeyir bir iş münasibətilə şirniyə qonaq eləmək. *Təzə evin şirnisini vermək. Paltarın şirnisini vermək.*

**ŞİRNİÇİ** *is.* Şirniyyat hazırlayıb satan adam, şirniyyatçı. *Səriyyə bir işçi qızı idi. Şirniçiyə ərə verilmişdi.* Mir Cəlal.

**ŞİRNİKDİRİCİ** *sif.* Şirnikləndirən, həvəsləndirici, rəğbətləndirən, maraq oyadan. *Şirnikdirici tədbirlər.*

**ŞİRNİKDİRMƏ** "Şirnikdirmək"dən *f.is.*

**ŞİRNİKDİRMƏK** *f.* Həvəsləndirmək, rəğbətləndirmək, şövqləndirmək, rəğbət oyatmaq, maraq oyatmaq. *Hacı Tağı Allahqulunu şirnikdirmək üçün ərə getmək vaxtı çoxdan keçmiş, çirkinlikdə özünə oxşayan təkcə qızını da ona verməyi vəd etmişdi.* Ə.Əbülhəsən.

**ŞİRNİKLƏNDİRMƏ** "Şirnikləndirmək"dən *f.is.*

**ŞİRNİKLƏNDİRMƏK** *f.* Bir işə həvəsləndirmək, daha da həvəs oyatmaq, rəğbətləndirmək, şövqləndirmək.

**ŞİRNİKLƏNMƏ** "Şirniklənmək"dən *f.is.*

**ŞİRNİKLƏNMƏK** *f.* Həvəslənmək, həvəsə gəlmək, şövqlənmək. *Əhməd şirnikləndi, oğlu Əmrahı yuxuda qoyub arx yuxarı getdi.* (Nağıl).

**ŞİRNİKMƏK** *f.* Alışmaq, öyrəşmək, uyuşmaq, həvəslənmək. [Bağban:] *Nə deyim, qızdır, şirnikməsə, qaçmaq istəsə, ona da həmiyyət göstərərəm.* Ə.Məmmədxanlı.

**ŞİRNİKLİK** *is.* Şirni olaraq verilən pay. [Arvad dərzisi:] *Qayçım parçanı kəsmir, şirniklik üçün "qayçıkəsməz" verin, qayçım da kəssin.* R.Əfəndiyev.

**ŞİRNİYYAT** *is.* [*fars.*] Şirnidən hazırlanan hər növ dadlı, şirin şeylər, qənnadı məmulatı. *Süfrəyə şirniyyat düzmək. – Bayrama xüsusi şəkərçörəyi, badamçörəyi, paxlava sair bu kimi şirniyyat bişirib hazırlardılar.* H.Sarabski. [Ceyran xala:] *Bənövşə, nişanlın üçün xüsusi şirniyyat bişirmişəm.* S.Rəhman.

**ŞİRPƏNCƏSİ** *is. bot.* Yaşımtıl çiçəkləri və qırış-qırış yarpaqları olan ot bitkisi.

**ŞİR-ŞƏKİL** *is. dan.* Üz, sifət, görkəm, sir-sifət. *Onun şir-şəkili xoşuna gəlmir. Bu nə şir-şəkildir?*

**ŞİRVANŞAHLAR** *is.* Ərəb işğalına qədərki Şirvanşahlar dövlətində hökmdarlar sülaləsi.

**ŞİST** *is. geol.* Quruluşca lay-lay olan dağ süxuru. *Gil layları güclü təzyiqin və istiliyin təsirindən şistə çevrilir.* M.Qaşqay.

**ŞİŞ¹** 1. *is.* Bədənin hər hansı bir yerində əmələ gələn toxuma qabarması; ur. *Üzdə şiş. Başda şiş. Qıçının şişi çəkilmək.* – [Kişi:] *Dirsəkdən yuxarı qolumda şiş əmələ gəldi.* M.İbrahimov. // *tib.* Hər hansı bir bədən üzvü toxumasının qeyri-normal böyüyüb artması. *Qorxusuz şiş. Qorxulu şiş.*

2. *sif. məc.* Köp, qabarıq, irəliyə doğru çıxmış. *Şiş qarın.* // Qalın, şişmiş. *Yarməmməd şiş qovluğu açdı.* M.İbrahimov.

**ŞİŞ²** 1. *is.* Kabab bişirmək üçün ucu iti dəmir və ya ağac çubuq. *Əti şişə çəkmək. Bir şiş kabab.* – [Çingiz:] *..Bir budu şişə çəkib, iki çörək ilə tək yemişəm.* Ə.Haqverdiyev. *..İncə ətirli budaqlardan şişlər, ocaqlarda yaqut kimi qızarar közlər hazırlanmışdı.* M.Rzaquluzadə.

2. *sif.* İti, sivri. [Pəricahan xanım:] [Onlar] *o şiş papaqlarını qoyub qaçmışlar.* S.S.Axundov. *Şiş ucları buludlarla döyüşən; Dağlarında buzları var ölkəmin.* C.Cabbarlı.

◊ **Şişə taxmaq (çəkmək)** *məc.* – əziyyət vermək, zülm etmək, bərk incitmək. *Ögey ana uşaqları şişə taxır. – Xanzadələr şişə taxır rəyəti.* Q.Zakir. **Şişdə ütmək** – b a x **şişə taxmaq**.

**ŞİŞBAŞ(LI)** *sif.* Başı uzunsov, uzunbaşlı.

**ŞİŞBURUN** *sif.* Burnunun ucu iti, nazik. *Şişburun oğlan. – Direktor iri göz, şişburun bir adamdı.* Mir Cəlal.

**ŞİŞDİRMƏ** "Şişdirmək"dən *f.is.*

**ŞİŞDİRMƏK** b a x **şişirtmək**.

**ŞİŞƏ** b a x **şüşə**. *Bir səbət şişə bir nəfər hammal; Aparırdı dalında malamal.* S.Ə.Şirvani.

**ŞİŞƏBƏND** b a x **şüşəbənd**. *Zeynal geniş bir şişəbəndi keçib yemək otağına girdi.* S.Hüseyn.

**ŞİŞƏK** *is.* Müxtəlif yerlərdə müxtəlif (2-4) yaşlarda olan erkək qoyun. *Toğlu birillik, şişək ikiillik, öküz üçillik olardı.* H.Sarabski. [Ərşad] *..öz sürüsünə qatdığı toğludan, şişəkdən gecə dayısıgilə ötürməyi unutmurdu.* İ.Əfəndiyev. *Tahirzadənin ilk işi o oldu ki, şərikli kəsdikləri şişəyin bütöv bir şaqqasını ayırıb, südçü məhəlləsinə, Məsmənin evinə göndərdi*. Mir Cəlal.

**ŞİŞİK** b a x **şişkin**.

**ŞİŞİRDİLMƏ** "Şişirdilmək"dən *f.is.*

**ŞİŞİRDİLMƏK** *f.* 1. Şişkin hala salınmaq, üfürülüb qabarılmaq, köpürülmək.

2. *məc.* Artırılmaq, üstünə qoyulmaq, mübaliğə edilmək. *Damcılı bulağa söz qoşulur, az qala damcısı bir dərya boyda şişirdilirdi.* S.Rəhimov. // *məc*. Lüzumsuz yerə artırılmaq. *Əsər 200 səhifədən 400 səhifəyə qədər şişirdildi.*

**ŞİŞİRDİLMİŞ** *sif.* 1. Şişkin hala gətirilmiş, üfürməklə doldurulmuş (qazla, hava ilə), köpdürülmüş.

2. *məc.* Artırılmış, üstünə qoyulmuş, mübaliğə edilmiş; mübaliğəli. *Şişirdilmiş hadisə.* // *məc*. Olduğundan daha artıq, daha güclü bir şəkildə təqdim edilmiş, göstərilmiş. *Şişirdilmiş məlumat. Şişirdilmiş hesabat. Şişirdilmiş rəqəmlər.*

**ŞİŞİRİLMƏK** b a x **şişirdilmək**.

**ŞİŞİRİLMİŞ** b a x **şişirdilmiş**. *Sensasiya xasiyyəti daşıyan şişirilmiş xəbərlərdən ..* [Firidun] *rəsmi dairələrdə Kərimxangilin tutulması ilə əlaqədar nə kimi fikirlər hakim olduğunu müəyyən etmək istəyirdi.* M.İbrahimov.

**ŞİŞİRTMƏ** 1. "Şişirtmək"dən *f.is.*

2. *Sif. mənasında.* Mübaliğəli. *Qocalar gülüşür, ovçuluq çağlarının şişirtmə nağıllarına dadlı-dadlı qulaq asardılar.* S.Rəhimov.

**ŞİŞİRTMƏK** *f.* Üfürüb doldurmaq, köpürtmək, qabartmaq, şişkin hala gətirmək. *Şarı şişirtmək. Ordlarını şişirtmək. – Zurnaçılar ordlarını şişirdib, gözlərini süzürdülər*. Çəmənzəminli. *Nəriman əmi ordlarını şişirdərək əlini başına çəkib, məzəmmətlə Murada baxdı.* İ.Əfəndiyev. // Böyütmək, qabartmaq, artırmaq, yekəltmək. *Bostandakı kələmlər enə verir, balqabaqlar qarınlarını şişirdir, pomidorların sifəti qızarırdı.* Ə.Vəliyev.

2. Olduğundan daha güclü, daha artıq, daha mübaliğəli şəkildə təqdim etmək, təsvir etmək, söyləmək. *Məsələni şişirtmək. – Hansı bir yazıçı olur olsun, nə onu qərəzkarlıqla kiçiltmək, nə də qəsdən şişirdib böyütmək olmaz.* S.Rəhimov. [Salman:] *Yoldaş Şirzad çox tünd gedir, nöqsanları şişirdir!..* M.İbrahimov.

◊ **Özünü şişirtmək** – lovğalanmaq, qürrələnmək, təkəbbür satmaq, özünü dartmaq.

**ŞİŞKİN** *sif.* Şişmiş halda olan. [Sübhanverdizadənin] *bir az şişkin olan sifəti indi yanar köz kimi qızarmış*(*dı*).. S.Rəhimov. // Qabarmış, şişmiş, içi dolu. *Katib, Məmməd Həsənoviçin bozardığını gördükdə könülsüz geri dönər, qoltuğundakı şişkin qovluğu tərpədərək qapıdan çıxardı*. M.İbrahimov.

**ŞİŞKİNLƏŞMƏK** *f.* Şişkin olmaq, şişmək. *Qarnı şişkinləşmək.*

**ŞİŞKİNLİK** *is.* Şişmiş, köpmüş, qabarmış şeyin halı; şişmanlıq.

**ŞİŞQARIN** *sif.* Qarnı şiş, qabağa çıxmış; yekəqarın, şişman. *Bayram olcaq şövkətlilər, şanlılar; Dövlətlilər, pullular, milyanlılar; Tirboyunlar, şişqarınlar, canlılar*. M.Ə.Sabir.

**ŞİŞQULAQ** *sif.* Qulaqları şiş. *Şişqulaq it.*

**ŞİŞLƏMƏ** "Şişləmək"dən *f.is.*

**ŞİŞLƏMƏK** *f.* 1. Şiş etmək, ucunu iti eləmək, şiş hala gətirmək. *Student Həmzəbəy .. başını darayırdı, bığlarının uclarını maşa ilə şişləyib yuxarı qovzayırdı.* Çəmənzəminli.

2. Şişə keçirmək, şişə keçirib düzmək. *Əti şişləmək.* // Şişlə deşmək.

**ŞİŞLƏNMƏ** "Şişlənmək"dən *f.is.*

**ŞİŞLƏNMƏK** *f.* 1. Şiş durmaq, qabarmaq. *Onun əlləri titrəyirdi, bığları qaplan bığları kimi şişlənirdi.* M.S.Ordubadi.

2. Getdikcə daralmaq, ensizləşmək. *Yol getdikcə şişlənir.*

**ŞİŞLİK** *is.* 1. Şişə çəkilərək od üstündə bişirilən tikə-tikə ətdən ibarət yemək; tikə-kabab (rus dilində "şaşlık" şəklində işlənir). *Ov ətlərindən şişlik bişirmək üçün incə ətirli budaqlardan şişlər, ocaqlarda yaqut kimi qızaran közlər hazırlanmışdı*. M.Rzaquluzadə.

2. Ucu şiş alət. *Əlində şişlik meydana atıldı.*

**ŞİŞMAN** *sif.* Çox kök, yekəqarın, şişqarın. *Ayrım qızı qısaboylu, şişman bir qadın idi.*

A.Şaiq. // Qabağa çıxmış, şişmiş, qabarmış halda olan. *Ağ çuxalı, ağ arxalıqlı, ikiüzlü Buxara dərisindən papaqlı, şişman göbəyi üzərində gümüş kəmərli Mirzə Səfəri hamı tanıyırdı*. Ə.Haqverdiyev.

**ŞİŞMANCA** *sif.* Şişman, bir qədər şişman, bir qədər kök, dolğun. [Qonaq] *şişmanca bir adam idi*. S.Hüseyn. *Bu sırada şişmanca, ortaboylu, ciddi simalı Məcid əfəndi Rauf ilə bərabər çıxar.* H.Cavid.

**ŞİŞMANLAŞMA** "Şişmanlaşmaq"dan *f.is.*

**ŞİŞMANLAŞMAQ** *f.* Şişman olmaq, çox kökəlmək, qarın sallamaq.

**ŞİŞMANLIQ** *is.* Şişman adamın halı, köklük.

**ŞİŞMANSİFƏT(Lİ)** *sif.* Sifəti şişman, dolu olan, köksifət. *Şişmansifət adam.*

**ŞİŞMƏ** "Şişmək"dən *f.is.*

**ŞİŞMƏK** *f.* 1. Xəstəlik, zədə və s. nəticəsində qalxmaq, köpmək, qabarmaq. *Ayağı şişmək. Üzü şişmək. – Gözün üstü şişib olubdu qovuq; Zahirən bu gecə dəyibdi soyuq*. S.Ə.Şirvani. *Bayramın göz qapaqları şişib qırmızı olmuşdu*. M.Hüseyn. // İslanıb köpmək, böyümək, qabarmaq. *Noxud suda şişir. – Şeyxlər kişmişin bütöv olaraq xörəyə qatılmasını haram bilirdilər, çünki kişmiş şişdikcə içində dönüklük əmələ gəlib çaxır ola bilərdi.* Çəmənzəminli. *Sulu qar yağdıqca yer təkinə qədər islanır, elə bil köpüb şişirdi*. Ə.Əbülhəsən.

2. *məc.* Çox kökəlmək, piylənmək. *Yaman şişmisən ha. – Spekulyantlar tamam şişib filə dönmüşdülər*. E.Sultanov. [Xacə Firuz:] *Amma bunlar yeyib şişirlər*. Ə.Haqverdiyev.

3. *məc. dan.* Umsunmaq, tamarzı qalmaq, gözü qalmaq. *Kabab iyindən qonşular şişə bilər. – Bir tikə bozbaşdan ötrü ağlama! Umma, şişərsən, bala, sarsaqlama!* Ə.Nəzmi.

◊ **Başı şişmək** – b a x **baş**. **Ürəyi şişmək** – b a x **ürək**.

**ŞİŞPAPAQ** *sif.* 1. Papağı dik, şiş olan, başına şiş papaq qoymuş. *Şişpapaq kişi. – Hər dəvənin örkəni şişpapaq, beli qəməli bir sarbanın əlində idi.* Çəmənzəminli. // İs. mənasında. *İçərişəhərdə Qala küçəsi ilə gedirdim. Bir nəfər şişpapaq qabağımı kəsdi.* H.Sarabski.

2. *məc. dan.* Lovğa, özünüçəkən, təşəxxüslü.

**ŞİŞTƏPƏ** *is. coğr.* Dağın şiş təpəsi, zirvəsi; pik. // *sif.* Təpəsi şiş. *Şiştəpə dağ.*

**ŞİT** *sif.* 1. Duz qatılmamış, duzsuz. *Şit pendir. Şit kərə*. – [Mahmud:] *Bir kətəyə bax, şit yağı da basıblar arasına, adamın ağzının suyu axır.* Ə.Haqverdiyev. // Duzu az, lazımınca duzlanmamış. *Şit xörək.*

2. *məc.* Danışığı, hərəkətləri yüngül, qeyri-ciddi, bayağı; duzsuz. *Şit adam. – Zeynalın şit hərəkəti bitməyirdi.* A.Şaiq. [Qumru] *Bünyada şit görünən bir tərzdə gülümsünüb dedi*. Ə.Əbülhəsən. // *məc.* Dəcəl, sırtıq, üzlü, həyasız, şuluqçu. *Bizim şit uşaqlar və başqasına istehza etməkdən zövq alan adamlarla işimiz yoxdur.* M.İbrahimov. // Çox maraqsız, duzsuz, ət tökən. *Şit söhbətlər. Şit zarafat.*

◊ **Şit çıxmaq** – yerinə düşməmək; yersiz, münasibətsiz, qeyri-ciddi görünmək. *Yox, çoban, bu tutmadı, – deyə, Alı güldü, – budəfəki məsələn şit çıxdı.* Ə.Əbülhəsən. **Şiti çıxmaq** – 1) həddindən artıq bayağı görünmək, yersiz olmaq, həddini aşmaq, ifrata varmaq; 2) həddindən artıq çox olmaq, görünmək. **Şitini (şitini-şorunu) çıxartmaq** – öz hərəkətində hədd-hüdud bilməmək, həddini aşmaq, ağ eləmək, ifrata varmaq. *Lap şitini çıxartdıq*.

**ŞİTAB** [*fars.*] *klas.* Tələsmə, sürət, tezlik. ☐ **Şitab etmək (eyləmək)** *klas.* – tələsmək. *Sonradan olur peşiman; Hər kimsə ki, şitab eylər.* Q.Zakir. *Gün qürub etməyə edirdi şitab; Kainata enirdi bir zülmat.* C.Cabbarlı.

**ŞİTƏNGİ** *sif.* Nadinc, dəcəl, şuluq, üzlü, şit. *Şitəngi uşaq. – Sevdim isə şitəngi, dəcəl, həm də mollanın qələmini tutan, üzünə deyən idi.* Ə.Vəliyev.

**ŞİTƏNGİLİK** *is.* Nadinclik, dəcəllik, şuluqçuluq, üzlülük, şitlik. ☐ **Şitəngilik etmək** – nadinclik etmək, şitlik etmək. [Şərəfnisə xanım:] *Uşağı yerə girsin. Dinc oturur məgər. Səhərdən bəri qoymuyub ki, iki çəngə yun darıyım, elə şitəngilik edir.* M.F.Axundzadə. *Biz uşaqlıqda çox şitəngilik elərdik.* C.Məmmədquluzadə.

**ŞİTƏNMƏ** "Şitənmək"dən *f.is.*

**ŞİTƏNMƏK** *f.* Nadinclik etmək, dəcəllik etmək, şitlik eləmək. *Şitənmək, dalaşmaq və barışmaq – onların yoldaşlığı belə başlamışdı.* S.Rəhimov.

**ŞİTİL** *is.* Sonradan çıxarılıb başqa yerdə əkilmək üçün parnikdə (istixanada) və ya xüsusi ləklərdə yetişdirilən bitki. [Sona:] *Canı çıxsın, buraxmasın danasını evimizin yanına. Baxşı üçün qərənfil şitili əkmişəm, gəlib hamısını yeyib.* C.Cabbarlı.

**ŞİTİLƏKƏN** *is.* Şitil əkməyə məxsus maşın, alət.

**ŞİTİLLƏMƏ** 1. “Şitilləmək”dən *f.is.*

2. *k.t.* Bitki becərmə üsullarından biri (b a x *şitilləmək*). *Respublikamızın cənub-şərq tərəfində olan Astara, Lənkəran və Masallı rayonlarında çəltik şitilləmə vasitəsilə yetişdirilir.*

**ŞİTİLLƏMƏK** *f. k.t.* Bitkini seyrəltmək, çıxarıb seyrək əkmək.

**ŞİTİLLİK** *is.* Şitil yetişdirilən yer; tinglik. [Eyvaz:] *Mən ondan ayrılaraq, təzə bağın qurtaracağında saldığımız şitilliyə getdim.* İ.Əfəndiyev.

**ŞİTLƏNMƏ** “Şitlənmək”dən *f.is.*

**ŞİTLƏNMƏK** *f.* Yüngüllük eləmək, qeyri-ciddi hərəkətlər göstərmək, şit-şit danışmaq.

**ŞİTLİK** *is.* 1. Şit, duzu az şeyin halı, keyfiyyəti. *Şitliyindən xörəyi yemək olmur.*

2. *məc.* Qeyri-ciddi, yüngül, bayağı, duzsuz hərəkət, söz. // *məc.* Nadinclik, dəcəllik, üzlülük; şit hərəkətlər, şit sözlər və s. *Müəllimənin gözləri .. bəzi uşaqların şitlik və dəcəlliyinin qarşısını almaqda onun əsas köməkçilərindən idi.* S.Rəhimov. ☐ **Şitlik eləmək** – 1) nadinclik eləmək, dəcəllik eləmək, üz gətirmək. [Güləsər] *tez-tez şitlik edir*(*di*). İ.Şıxlı; 2) yüngüllük eləmək, hərəkətində, sözündə ifrata varmaq. *Amma Molla özü heç qorxmayıb, əvvəlkindən də bir az artıq şitlik eləyir.* “M.N.lətif.”

**ŞİT-ŞİT** *zərf* Şit, qeyri-ciddi, yüngül-yüngül. *Şit-şit danışmaq. Şit-şit gülmək.* // *məc.* Yüngüllük, bayağılıq, qeyri-ciddilik; yüngül, bayağı, qeyri-ciddi hərəkət.

**ŞİT-ŞOR: şitini-şorunu çıxarmaq** *dan.* – B a x **şitini çıxar(t)maq** (“**şit**”də).

**ŞİV** *is.* Ağacın nazik, kiçik budağı, cavan budaq. *Qonaqlar Gülşənin göstərdiyi şivlərə, tez-tez qoparıb atdığı qönçələrə uzun müddət baxdılar.* Ə.Vəliyev. *Söyüd şivləri qırıldıqca yasavullar yenisini gətirirdilər.* Mir Cəlal.

**ŞİVAİZM** *is.* Hindistanda dağıdıcı allah Şivanın adından dini cərəyan.

**ŞİVƏ** *is.* [*fars.*] 1. Danışma tərzi, tələffüz tərzi, tələffüz. *Dostum haman kitabı bükdü, qoydu stolun üstə və durdu, getdi, şkafdan yenə bir köhnə kitab çıxartdı, gətirdi və həmən kitabı iki əlilə yuxarı qalxızdı, şairanə bir şivə ilə mənə dedi.* C.Məmmədquluzadə. *Tətbiq edəcəkdir yazını şiveyi-türkə.* M.Ə.Sabir. *Süleyman bəy ağzını açan kimi gördülər ki, hərif dilin dəyişib, daha İstanbul şivəsilə danışmır.* B.Talıblı. // Üsul, tərz, tövr. [Odabaşı:] *Bu başqa bir şivə ilə meydana çıxmışdı.* Ə.Haqverdiyev. // *dilç.* Bir əraziyə, məhəllə aid olan dialektin yerli növü.

2. Naz, qəmzə, əda, işvə. *Canımın cövhəri ol ləli-gühərbarə fəda; Ömrümün hasili ol şiveyi-rəftarə fəda.* Füzuli. *Zeynal çox mütəəssir idi. Mehribanın xoş bir işvə ilə ona xitab etməsi həyəcanını artırdı.* S.Hüseyn.

3. *məc.* Hərəkətdə, danışıqda sünilik, saxtalıq, ikiüzlülük. [Laçın bəy:] *..Cəmilin hərəkətləri olub yalan, büxl, şivə, müftəxorluq.* N.Vəzirov.

4. *klas.* b a x **şivən**. *Batdın genə bəxtim kimi bilməm nə qərayə; Qurban sənə, bu şivəyi-matəm nə üçündür?* S.Ə.Şirvani.

**ŞİVƏBAZ** *sif.* [*fars.*] Şivəli, nazlı, ədalı.

**ŞİVƏBAZLIQ** *is.* İşvəbazlıq; naz satma, işvə satma xasiyyəti.

**ŞİVƏKAR** b a x **işvəkar**. *Hər əhli hüsn kim, mən bədbəxtə yar olur; Bilməm, nə rəmzdir ki, dönüb şivəkar olur.* S.Ə.Şirvani. *Günəş İşıqlı dağının dalından şivəkar qızlar kimi gülümsəyir və yavaş-yavaş kölgələri udurdu.* Ə.Vəliyev.

**ŞİVƏLİ** *sif.* Yazlı, qəmzəli, ədalı, cilvəli, işvəkar. *Şivəli gözlər.*

**ŞİVƏN** *is.* [*fars.*] Fəryad, fəğan, nalə, bərk ağlaşma, matəm, yas. *Seyyid, aşiq olalı bilmişəm aşiqlər işin; Ah imiş, nalə imiş, girye imiş, şivən imiş.* S.Ə.Şirvani. *Bülbül dedi:* “*– Dünyada o kimdir gülə bir gün; İllərcə zəbun etməyə şən könlünü şivən*”. H.Cavid. ☐ **Şivən etmək (qaldırmaq, qılmaq, qoparmaq, salmaq)** – bərk ağlamaq, fəryad qoparmaq, fəğan etmək. *Gedərəm, kuyində qıllam şivəni; Yığaram başıma dostu, düşməni.*

M.P.Vaqif. *Sərdarovların evində şivən qopmuşdu. Dörd bacının bircə qardaşının Türküstanda öldüyü xəbəri teleqrafla gəlmişdi.* Ə.Haqverdiyev. // Qiyamət qoparmaq, haray salmaq, mərəkə qoparmaq. *Əvvəllər evlənmək söhbəti düşəndə Şərif bir tikə narahat olub şivən eləməzdi.* C.Məmmədquluzadə. // Yas, matəm, ağlaşma. *Ölüsü bir gün, şivəni min gün.* (Ata. sözü). ☐ **Şivən qurmaq** – matəm məclisi qurmaq, yas tutmaq. *Namərd müxənnətin boynu vurulsun; Vay düşsün evinə, şivən qurulsun.* Aşıq Ələsgər. **Şivən qopmaq** – fəryad qopmaq, bərk ağlaşma düşmək. *..Yenicə yatağıma uzanmışdım ki, qonşu evdən acıqlı və yanıqlı bir şivən qopdu.* A.Şaiq. *Bir az əvvəl qəmli və ağır sükuta batmış qadınlardan yenə şivən qopdu.* M.Hüseyn.

**ŞİVƏNLİ** *sif.* Faciəli, dəhşətli, məşum. *Şivənli səs.* – *Axşam çökdü şəhərə; Bir südlü, aylı axşam; Çoxlu xəbər gətirdi; Şivənli, vaylı axşam.* Ə.Cavad.

**ŞİVƏRƏK** *sif.* Düz, uzun və nazik. *Şivərək ağac. Şivərək budaq.* – *İndi getdikcə kolkosluq azalır, meşənin dibi açılaraq, yan-yörədə şivərək boz puf ağacları göyə baş qaldırırdı.* Ə.Əbülhəsən. // *məc.* Nazik və boylu-buxunlu. *Şivərək oğlan. Şivərək uşaq.*

**ŞİVƏRƏN** *is. bot.* Xalq təbabətində toxumu yanğıkəsən dərman kimi işlədilən ot bitkisi.

**ŞİVLƏMƏ** "Şivləmək"dən *f.is.*

**ŞİVLƏMƏK** *f.* Şiv əmələ gəlmək, şiv qalxmaq, şiv çıxmaq. *Şil-küt olmuş ağaclar yarpaqlarını sağaldır, şivləyirdi.* S.Rəhimov.

**ŞİZOFRENÍYA** [*yun.* schizophren] Səbəbi bəlli olmayan ruhi xəstəlik.

**ŞKAF** *is.* Paltar, kitab, qab-qacaq və s. qoymaq üçün irili-xırdalı gözləri olan qapılı mebel növü; dolab. *Divar şkafı. Güzgülü şkaf. Kitab şkafı.* – [Kitabpaylayan:] *O qədər lazımlı kitablar var ki, üstünü toz basa-basa qalıb bu şkaflarda.* Ə.Haqverdiyev. *Qafar əllərini yuduqdan sonra kiçik şkafdan stol üstünə boşqab və çəngəl qoydu.* Ə.Əbülhəsən.

**ŞKALÁ** [*lat.*] 1. Müxtəlif ölçü cihazlarında dərəcələrə bölünmüş lineyka və ya siferblat. *Manometr ilə seçilməlidir ki, təzyiq işlək halda olduqda əqrəb şkalanın orta hissəsində dayansın.* M.Sultanov.

2. Hər hansı bir kəmiyyəti müəyyənləşdirmək üçün qəbul olunmuş rəqəmlər sistemi. *Vergi şkalası.*

**ŞKİF** *is.* [*holl.*] Qayış və ya kanat vasitəsilə hərəkət ötürücü çarx.

**ŞKİPER** *is.* [*holl.*] *köhn.* 1. Ticarət gəmisi kapitanı.

2. Gəmi əmlakına baxan.

**ŞLAK** *is.* [*alm.*] 1. Metal kəfi və daş kömür külü.

2. Gərəksiz şey.

**ŞLAQBÁUM** [*alm.*] Dəmir yolunu kəsib keçən şose yolunu qatar gələndə, yaxud adi yollarda hər hansı bir səbəbə görə onları açıb-bağlamaq üçün endirilib qaldırılan tir. *Növbətçisi olan dəmir yolu keçidi qarşısında hər iki tərəfdən şlaqbaum qoyulur.* Ə.Əliyev.

**ŞLAM** *is.* [*alm.*] Qiymətli hissələrindən istifadə etmək üçün xırdalanan filiz və ya kömür.

**ŞLANQ** [*alm.*] *tex.* Maye, qaz və s. kimi şeyləri sorub çəkmək və ya keçirmək üçün rezin, yaxud su keçirməyən materialdan qayrılmış boru. [Mühəndis] *şlanqlar quyuya enib-qalxdıqca baltanın səsinə qulaq asmağa başladı.* A.Şaiq. *Boş vaxtlarında* [ustanı].. *əlində şlanq ağaclar arasında dolanan görərdin.* Mir Cəlal.

**ŞLEM** [*rus.*] b a x **dəbilqə**.

**ŞLEMLİ** *sif.* Başında şlem olan, başına şlem qoymuş, dəbilqəli. *İçəridə qızınan şlemli qızıl əsgər nədənsə çox ərinə-ərinə cavab verdi.* M.Hüseyn.

**ŞLEYF** *is.* [*alm.*] Qadın paltarının arxadan sürünən ətəyi.

**ŞLİF** *is.* [*alm.*] Mədən süxurunun və yaxud mineralının yaxşı pardaxlanmış lövhəciyi.

**ŞLİX** *is.* [*alm.*] 1. Kənar qarışıqlardan təmizlənmək üçün xəlbirdən keçirilən yuyulmuş qızıl və ya platinli qum.

2. Metal əritmək üçün xırdalanmış filiz.

**ŞLÜZ** [*alm.*] 1. *tex.* Gəmilərin suyu müxtəlif səviyyədə olan çay və kanallardan keçməsi üçün xüsusi hidrotexniki qurğu. *Gəmimiz birinci şlüzə daxil oldu.* M.İbrahimov. *Biz birinci darvazadan keçdik, kanalın ilk şlüzündə dayandıq.* Mir Cəlal.

2. *tex.* Çayda, kanalda suyu saxlamaq və lazım gəldikdə açıb buraxmaq üçün xüsusi

qapı. *Kür çayında müxtəlif şlüzlər düzəldiləcək ki, bu da su daşqınının qarşısını alacaqdır.* M.Qaşqay.

3. *məd.* İçərisində qızıl olan qumu və ya xırda süxuru yumaq üçün təknəyə və ya çalovaoxşar qurğu.

**ŞLÜZLƏMƏ** "Şlüzləmək"dən *f.is.*

**ŞLÜZLƏMƏK** *f. tex.* 1. Şlüz düzəltmək, şlüz qurmaq.

2. Şlüzdən buraxmaq, keçirmək. *Gəmiləri şlüzləmək.*

**ŞLYÁPA** [*rus.*] Fetrdən, plüşdən, həsirdən hazırlanan baş geyimi. *İskəndər şlyapasını krovatın üstünə çırpıb, başlayır papiros eşməyə.* C.Məmmədquluzadə. [Nəriman] *üzünü tərtəmiz taraş etdirərək həsir şlyapa qoymuşdu.* İ.Əfəndiyev. [Cavan] *xüsusən yoldaşımın qalstukuna, gözlüyünə və divarda mıxdan asılmış fetr şlyapasına ötəri nəzər saldı.* M.Rzaquluzadə.

**ŞLYAPALI** *sif.* Başında şlyapa olan, başına şlyapa qoymuş. *Şlyapalı qadın. Şlyapalı oğlan. – Göy şlyapalı kişi bu sözə doyunca gül*(*dü*).. S.Rəhman. // *İs. mənasında.* Başında şlyapa olan. *Şlyapalı irişib arğaz adama işarə elədi.* B.Bayramov.

**ŞOFÉR** [*fr.* chauffeur] Avtomobil sürücüsü. *Şofer maşını geriyə döndərdi və hamar yolla sürərək vağzala istiqamət aldı.* M.Hüseyn. *Bu zaman qırx yaşında, enli qaraqaş, qarabığ şofer də eyvana çıxdı.* İ.Əfəndiyev.

**ŞOFERLİK** *is.* Şofer sənəti, şofer peşəsi. *Şoferlik etmək. Şoferlik kursunda oxumaq. – ..Dursun şoferliyə qızlardan şagird qoydu.* Ə.Əbülhəsən.

**ŞOĞƏRİB** *is.* və *sif. dan.* Xoşagəlməz bir şey haqqında yüngül söyüş. [Səfər:] *Şoğərib* [qənd] *o qədər ağırdır ki, çiynimi lap üzüb.* C.Cabbarlı. [Xavərnisə:] *Ağlamayıram, soğan şoğəribin acısıdır ki, gözlərim yaşarmışdır.* T.Ş.Simurq. [Hacı:] *Görürsənmi, şoğərib adamı necə danışdırır. İndi bir az da içsə, lap müctəhid olacaq.* B.Talıblı.

◊ **Şoğəribə qalsın! (qalaydı!)** – "yiyəsiz qalsın" mənasında qarğış ifadəsi. *Kəblə Novruzqulu səsdən təngə gəlib: – Ə... ə... köpək oğlunun malları, şoğəribə qalasınız, xeyrata kəsiləsiniz, – deyə mırıldanırdı.* H.Sarabski. [Bəhlul:] *Köhnələr demişkən, kaş təzə geyimim şoğəribə qalaydı.* B.Bayramov.

**ŞOK** [*fr.*] *tib.* Ağır fiziki travma və ya ruhi sarsıntı nəticəsində orqanizm funksiyalarının kəskin surətdə pozuluşu. *Xəstə şok halındadır. – Fəqərələrin, çanaq və omba sümüklərinin və başqa bu kimi sümüklərin sınması ilə nəticələnən ağır zədələnmə hallarında orqanizmin ümumi fəaliyyəti pozularaq şok halına düşə bilər.* Ə.Babayev.

**ŞOKOLÁD** [*isp.*] 1. Kakao toxumu ilə şəkər və ədvə qatışığından hazırlanan kütlə və ya poroşok. // Bu kütlədən hazırlanan konfet və plitka şəklində qənnadı növü. *Kimi qəhvə, kimi şokolad, təyyarəçi də çaxır ilə məzə istədi.* Çəmənzəminli. *Qadın masanın üstünə şokolad və konfet düzüb, Hüseynə lap yaxın oturdu.* S.Rəhman.

2. Bu poroşokdan südlə hazırlanan içki.

**ŞOKOLADLI** *sif.* Şokolad qarışıq, tərkibində şokolad olan. *Şokoladlı dondurma. Şokoladlı konfet. Şokoladlı tort.* // *məc.* Çox dadlı, ləzzətli şey haqqında. *Bu kabab deyil ki, marmeladdı, şokoladdı.* N.Vəzirov.

**ŞOL** "Ol" işarə əvəzliyinin qədim forması. *Daima istər Xətayi şah cəmalın görməyə; Şol gədayi-alihimmət talibi-didar məst.* Xətayi. *Şol qamətin yayınanda gözümdən; Sanasan ki, həşrü qiyamətimdir.* M.P.Vaqif. *Böyük oğlun gəzir payi-piyadə; Şol biri də tələf oldu aradə.* Q.Zakir.

**ŞOMU** *is. məh.* İspanaq. *Tərəçiçəklilər .. fəsiləsindən becərilən cinslərdən biri də ispanaq və ya şomudur.* M.Qasımov.

**ŞONQAR** b a x **şahin**. *İki şonqar dalaşanda bir qarğaya cürm düşər*. (Ata. sözü). *Şahin, şonqar sürbənizi dağıdar; Boyanarsız qızıl qana, durnalar.* M.V.Vidadi. *Xanın sağında-solunda düzülən yasavullar, qollarında qızılquş, şonqar, qaraquş aparan quş bəyləri, şikarçılar, nökərlər böyük bir yarımdairə təşkil etmişdilər.* M.Rzaquluzadə.

**ŞOR¹** *is.* Çürüdülüb süzülmüş ayrandan hazırlanan ağartı (qatı kütlə halında sadə pendir). [Sənəm] *pəncərənin qabağında bir süfrə salardı, üstünə çörək, pendir, şor, kərə .. qoyardı*. E.Sultanov. [Göyçək] *ayranı çürüdüb şor elədi.* Ə.Vəliyev.

**ŞOR²** *sif.* 1. Tərkibində çox duz olan, duzlu. *Şor su. Şor pendir. ..Görürsünüz ki, Kür suyunun dadı nə acıdır, nə şordur, pis qoxusu var, nə iylidir.* C.Məmmədquluzadə. [Kəblə Rə-

cəb:] *Kor da bilir ki, balıq şordur.* Ə.Haqverdiyev. *Kamil qocanın ortaya qoyduğu çörəklə şor balığı acgözlüklə yeməyə başladı.* M.Süleymanov. // Duzlu suya qoyulmuş, şoraba edilmiş, tutulmuş. *Şor kələm. Şor xiyar.* // Duzu çox düşmüş. *Şor xörək. – Çay gec oldumu, xörək isti verildimi, bozbaş bir az şor oldumu, arvad döyüləcəkdi.* T.Ş.Simurq.

2. Şoran. *Araz boyundakı şor qışlaqlarda; Doyunca nə qoyun, nə mal sağıldı.* S.Vurğun. *Şor düzlərə böyük arxlar çəkilib; Toybayramın tamaşası yaxşıdır.* Aşıq Əhməd.

◊ **Şorunu-şitini çıxartmaq** b a x **şitini (şitini-şorunu) çıxartmaq**.

**ŞORA** *is.* Çeşidli metalların qarışığından düzəldilib partlayıcı maddələr texnikasında aqranomiyada gübrə kimi işlədilən azot duzu.

**ŞORABA** *is.* Duzlu suya (duza) qoyulan tərəvəz. *Xiyar şorabası. Pomidor şorabası. – Nahar süfrəsi üçün də göy-göyərti, soğan, sirkə, şoraba, nə lazımdırsa hazırlandı.* Ə.Vəliyev. [Səriyyə:] *Stolun üstünə təzə ağ süfrə saldım. Badımcan şorabası doğradım.* İ.Əfəndiyev.

**ŞORAKƏT** b a x **şoran**. *Tərəçiçəklilər fəsiləsində şorakət və şoran torpaqlarda yayılmış bitkilər və alaq bitkiləri daha çoxdur.* H.Qədirov.

**ŞORAKƏTLƏŞMƏ** "Şorakətləşmək"dən *f.is.*

**ŞORAKƏTLƏŞMƏK** b a x **şoranlaşmaq**. *Qarabağ düzündə boz torpaqlar şorakətləşərkən onların lil hissəciklərinin bir hissəsi aşağı qatlara hərəkət edir.* E.Salayev.

**ŞORAKƏTLİ** b a x **şoranlı**.

**ŞORAKƏTLİK** b a x **şoranlıq**. [Naz ağacı] *güney yer sevən, küləyə və torpağın şorakətliyinə nisbətən davamlı, becərmə etibarilə az tələbkar bitkidir.* H.Qədirov.

**ŞORAQ** *sif.* Dadı şor olan, şor. *Şoraq xörək.*

**ŞORALAMA** "Şoralamaq"dan *f.is.*

**ŞORALAMAQ** *f.* Yüksəkdən tökmək, axıtmaq. *Südü şoralamaq. Suyu şoralamaq.*

**ŞORALANMA** "Şoralanmaq"dan *f.is.*

**ŞORALANMAQ** *f.* Birdən tökülmək, güclü axmaq. *Qab əyilən kimi su yerə şoralandı. Uşağın qolundan qan şoralandı.*

**ŞORAN** 1. *sif.* Duzlu, duz hopmuş. *Şoran torpaq. Şoran yerlər. – Un ələnmiş kimi ağımtıl-sarı şoran torpağın üzərində təzəcə ceyran izləri aydın görünürdü.* M.Rzaquluzadə.

2. *is.* Duzlu (duz hopmuş) torpaq. *Şoranda heç şey bitməz.*

**ŞORANLAŞMA** 1. "Şoranlaşmaq"dan *f.is.*

2. Torpaqda mineral duzların çoxalması və onun əkinçilik üçün yararsız hala gəlməsi.

**ŞORANLAŞMAQ** *f.* Duzlu olmaq, tərkibinə çoxlu duz yığılmaq, duzlanmaq. *Çox şoran olan torpaq suları dayazdadır, bu isə torpağın şoranlaşmasına səbəb olur.*

**ŞORANLI** *sif.* Tərkibində duz olan, duzlu. *Şoranlı torpaqlar.*

**ŞORANLIQ** *is.* Şoran, şoran yer, torpaq. *Bir-birini qova-qova gəlib keçir aylar, illər; Şoranlıqda bağ salınır, bataqlıqda qızılgüllər.* S.Vurğun. *Əkilmiş yerlərdən sonra Günəşin altında yanıb sifətinə boz ləkə düşmüş şoranlıqlar başlanırdı.* Ə.Vəliyev.

**ŞORANOTU** *is. bot.* Şoranlıqlarda bitən boz gövdəli kol – ağac. [Şoranotu] *hündür kol və ya kiçik ağac olub, açıq-boz rəngli qabıqla örtülmüş gövdəyə və rəngli qol-budaqlara malikdir. Növbə ilə düzülmüş 4-8 sm uzunluqda davamsız və sapvari yarpaqları vardır.* R.Əliyev.

**ŞORAZAR** b a x **şorakət**. *Şorazar torpaqlar.*

**ŞORBA** *is.* Ət, toyuq (və ya onlarsız) düyü, turşu və s. ilə hazırlanan duru xörək. [Şərəf:] *İndicə şorba bişirəcəyəm, doyunca yeyib yatarsan.* Ə.Haqverdiyev. ..[Ağca xanım] *qəsdən şorbanı süfrəyə tökdü ki, bəlkə onu tənbeh edib, yenə Baba otağına salalar..* S.S.Axundov.

**ŞORDÜZƏN** *is.* Şoranlıqdan ibarət düzən, çöl. [Yaşar:] *Beləliklə, bir az keçmədən şordüzən zəngin bir pambıq tarlasına çevrilmiş olar.* C.Cabbarlı.

**ŞORGÖZ** *sif. vulq.* Qadın düşkünü, arvadbaz. *Şorgöz bizim vilayətdə o kişilərə deyirlər ki, həmişə gözləri arvadların dalınca olur.* E.Sultanov. [Telli:] *Yaxşı ki, qonaq gəldi, məni ağamın əlindən qurtardı. Belə şorgöz kişi olmaz.* Ü.Hacıbəyov.

**ŞORGÖZLÜK** *is. vulq.* Şorgöz kişinin xasiyyəti, qadın düşkünlüyü. ..*Şorgözlük başqa bir şey deyil, məhz mərəzdir.* E.Sultanov. [Kəlbalı:] *Sənin canın üçün, Göyərçin, mən*

*dünyada şorgözlük nə olduğunu əsla bilmərəm.* S.Rəhimov.

**ŞORQOĞALI** *is.* İçərisində un, yağ, ədvə ilə qarışıq şorməzə iç qoyulan qoğal növü. *Ramazan ayının özünəməxsus süfrəsi vardı: firni, tərək, balhalvası, nazik yuxa, şorqoğalı və sairə.* H.Sarabski.

**ŞORLANMA** "Şorlanmaq"dan *f.is.*

**ŞORLANMAQ** *f.* Şor olmaq, şor dadı vermək. [Veysin] *hərdənbir dili dodağına dəyərkən ağzı şorlanırdı*. Ə.Əbülhəsən.

**ŞORLAR** *cəm* Şimali Altayda yaşayan türkdilli xalq.

**ŞORLAŞDIRMA** "Şorlaşdırmaq"dan *f.is.*

**ŞORLAŞDIRMAQ** *f.* Tərkibinə duz hopdurmaq, şorluğunu artırmaq, duzlu etmək, şor etmək, şoranlaşdırmaq. *..İzafi rütubətin buxarlanması zamanı duzlar torpağın səthinə qədər qalxaraq onu şorlaşdırır.* H.Salayev.

**ŞORLAŞMA** "Şorlaşmaq"dan *f.is.*

**ŞORLAŞMAQ** bax **şoranlaşmaq**.

**ŞORT** [*ing.*] Qısa şalvar növü.

**ŞORTMA** "Şortmaq"dan *f.is.*

**ŞORTMAQ** *f. dan.* Bərk qaçmaq.

**ŞORTU** *sif. vulq*. Əxlaqsız, pozğun, son dərəcə həyasız, usanmaz, abırsız.

**ŞORTULUQ** *is. vulq*. Əxlaqsızlıq, pozğunluq, ifrat dərəcədə həyasızlıq, utanmazlıq, abırsızlıq.

**ŞORYARPAQ** *is. bot.* Turşəngə oxşar turş bitki.

**ŞOSÉ** [*fr.*] Çınqıl döşənmiş və ya asfalt, yaxud sement-betonla örtülmüş yol. [Cəmilə və Mirzağa] *ahəstə addımlarla yan-yanaşı olaraq mədənlərin arasilə uzanıb gedən şose yolu ilə gedirdilər*. S.Hüseyn. *Səlim yağışın torpağa çoxmu, azmı işləmiş olduğunu yoxlamaq üçün bir addım şosedən kənara çıxdı.* M.Rzaquluzadə.

**ŞOŞAQ** *is. məh*. Selik, ağız suyu. *Dabaq öküz kimi axır şoşağı; Saqqalı uzunu damır aşağı.* H.K.Sanılı. [İlyas:] *Payızda hər gün yanıma qaçırdılar ki, yoldaş zootexnik, bəs deməzsənmi, heyvanın ağzından şoşaq tökülür.* İ.Hüseynov.

**ŞOTKÁ** [*rus.* щётка] Paltar, ayaqqabı və ya başqa bir şeyin tozunu almaq, təmizləmək üçün müxtəlif ölçü və biçimli lövhəcik üzərində sıx-sıx bərkidilmiş qıl və ya buna bənzər sərt tellərdən ibarət alət. *Paltar şotkası. Diş şotkası. Çəkmə şotkası.* – [Ortağı Musanın nəvəsinə] *çəkmə, qol saatı, gözlük, manjet, bığ şotkası aldı.* Qantəmir.

**ŞOTKALAMA** "Şotkalamaq"dan *f.is.*

**ŞOTKALAMAQ** *f.* Şotka ilə təmizləmək. *Arvadı da* [Mədədin] *dediklərinə əməl edib, hər gün ərinin çəkmələrinə yağrəng sürtüb şotkalardı.* Ə.Vəliyev. [Hüseyn] *şalvarını çox diqqətlə şotkaladı*. S.Rəhman.

**ŞOTKALANMA** "Şotkalanmaq"dan *f.is.*

**ŞOTKALANMAQ** *məch.* Şotka ilə təmizlənmək, şotka vurulmaq.

**ŞOTKALI** *sif.* Şotkası olan. *Şotkalı tozsoran.*

**ŞOT-KÖK: şot-kök eləmək** – iri, qaba tikiş vurmaq. *Arvad bir saatda köynəyi şot-kök eləyib geydi*.

**ŞOTLANDCA** *zərf* Şotland dilində. *Şotlandca danışmaq*.

**ŞOTLANDKÁ** *is.* [*rus.*] Xana-xana pambıq və ya ipək parça növü. *Paltarlıq şotlandka*. // Bu parçadan tikilmiş. *Şotlandka köynək. Şotlandka paltar*.

**ŞOTLANDLAR** *cəm* Şotlandiyanın əsas əhalisini təşkil edən xalq.

**ŞOU** *is.* [*ing.*] Əyləncəli estrada.

**ŞOVİNÍST** [*fr.*] Qatı millətçi.

**ŞOVİNÍZM** [*fr.* xüsusi addan] İfrat millətçilik; başqa millətlərə qarşı ədavət və nifrət təbliğ edən ən mürtəce burjua millətçiliyi.

**ŞÖBƏ** *is.* [*ər.*] 1. Bir idarənin, təşkilatın və ya müəssisənin bölməsi, hissəsi. *Xəstəxananın cərrahiyyə şöbəsi.* // Bir sistem daxilində ayrıca idarə, təşkilat və s. *Milis şöbəsi. Rabitə şöbəsi. Trestin rayon şöbəsi.*

2. Fakültə mənasında. *Universitetin hüquq şöbəsi. Biologiya şöbəsi. – Ancaq arzusuydu oxumaq onun; Tarix şöbəsində darülfünunun*. B.Vahabzadə.

3. *mus*. Hissə, parça mənasında. "*Mayeirast*"*dan sonra gələn növbəti şöbə* "*Hüseyni*"*dir.* Ü.Hacıbəyov.

**ŞÖHRƏT** *is.* [*ər.*] 1. Zəhmət, xidmət, istedad, məharət və s. nəticəsində hamı tərəfindən tanınma; məşhur olma, şərəfli ad qazanma, məşhurluq, ad-san. *Əmək şöhrəti. Artistin şöhrəti. Alimin şöhrəti dünyaya yayılmışdır.* – [Ağa Mərdan:] *Əgər bu iş mən deyən kimi*

*baş tutsa, Təbrizdə mənim şöhrətim ərşi-fələyə çıxacaq.* M.F.Axundzadə. *Hüseynin* [Ərəblinskinin] *şöhrəti də, təcrübəsi də get-gedə artırdı.* S.Rəhman. // Adı çıxma, ad qazanma. *C.Məmmədquluzadəni ədəbiyyata gətirən nə pul qazanmaq, nə də şöhrət həvəsi idi*. M.İbrahimov. ◻ **Şöhrət etmək** – məşhur olmaq, tanınmaq, ad çıxartmaq. [Hacı Nuru şair:] *Mərhum zəhmət çəkib sənə pakizə dəlləklik öyrətmişdi, sən ona razı olmayıb, Tiflis həkimləri kimi, istədin ki, həkimlikdə dəxi şöhrət edəsən*. M.F.Axundzadə. **Şöhrət qazanmaq (tapmaq)** – məşhur olmaq, hamı tərəfindən tanınmaq, məşhurlaşmaq. *..Qeyrətimə sığışdıra bilmirəm ki, mən dura-dura və mən olan yerdə məndən savayı bir özgə adam gəlib burada bir ad çıxartsın, gəlib Tiflisdə şöhrət qazansın*. C.Məmmədquluzadə. *Tapdıq qazmaçılar arasında öz mehribanlığı ilə şöhrət qazanmış* (f.sif.) *mahir bir usta idi.* M.Hüseyn.

2. Şöhrətbazlıq, şöhrət düşkünlüyü. *Teymurbəyi .. sövq edən yeganə amil şöhrət və heysiyyət məsələsi idi*. Çəmənzəminli.

3. Şan, şərəf, iftixar. *Əmək ölkəmizdə şərəf işinə çevrilmişdir. – Hər kəndə, hər şəhərə zinətdir bayrağımız; Alnıaçıq hər kəsə şöhrətdir bayrağımız*. S.Rüstəm.

**ŞÖHRƏTBAZ** [*ər.* şöhrət və *fars.* ...baz] b a x **şöhrətpərəst**.

**ŞÖHRƏTBAZLIQ** b a x **şöhrətpərəstlik**.

**ŞÖHRƏTGİR** *sif.* [*ər.* şöhrət və *fars.* ...gir] *klas.* Şöhrətli, şöhrət qazanmış, şöhrəti aləmi tutan, şöhrət tapmış, namdar. [Əzra Zəhraya:] *Bir baban var, cahanda şöhrətgir; Fazili-binəzir, Şeyxi-Kəbir*. H.Cavid.

**ŞÖHRƏTLƏNDİRİLMƏ** "Şöhrətləndirilmək"dən *f.is.*

**ŞÖHRƏTLƏNDİRİLMƏK** *məch.* Hamıya tanıdılmaq, məşhurlaşdırılmaq, məşhur edilmək, şöhrəti artırılmaq.

**ŞÖHRƏTLƏNDİRMƏ** "Şöhrətləndirmək"-dən *f.is.*

**ŞÖHRƏTLƏNDİRMƏK** *f.* Hamıya tanıtmaq, ad qazandırmaq, məşhur etmək, məşhurlaşdırmaq.

**ŞÖHRƏTLƏNMƏ** "Şöhrətlənmək"dən *f.is.*

**ŞÖHRƏTLƏNMƏK** *f.* Hər yerdə, hamı tərəfindən tanınmaq, məşhur olmaq, ad qazanmaq, şöhrət qazanmaq. *Rəmz anlayan, söz düşünən, dərd bilən; Aləmlərdə şöhrətlənir, bəllənir*. Qurbani. "*Flankəsi*" *barmaqnan göstərirlər, yəni gör nə qədər şöhrətlənib ki, hər yanda adı dillərdə söylənir*. C.Məmmədquluzadə.

**ŞÖHRƏTLİ** *sif.* Məşhur, məşhur olmaq, ad-san qazanmış, şöhrət qazanmış, tanınmış, namdar. *Şöhrətli kompozitor. Şöhrətli qəhrəmanlarımız. – Məlum şeydir ki, alimlərimiz və şöhrətli yazıçılarımızın çoxu Bakidədirlər*. C.Məmmədquluzadə.

**ŞÖHRƏTPƏRƏST** *sif.* [*ər.* şöhrət və *fars.* ...pərəst] Şöhrət düşkünü; vəzifə, fəxri mövqe, ad, vəzifə və s.-yə həddən artıq can atan; təkəbbürlü, lovğa. *O çox şöhrətpərəst adamdır. – Çox savadlı və çox bilikli, şöhrətpərəst, xudbin, hakimiyyət sevən oğrunun, həris və yalançının öhdəsindən gəlmək çox çətindir*. M.İbrahimov.

**ŞÖHRƏTPƏRƏSTLİK** *is.* Şöhrət düşkünlüyü, şöhrətə, adı çıxmağa, böyük vəzifə, mövqe tutmağa həddindən artıq can atma; təkəbbür, lovğalıq. *İctimai mənşə etibarı ilə onlara yabançı olan bu adamın* [Siratın] *şöhrətpərəstliyi də Büləndən gizli deyildi*. Ə.Əbülhəsən.

**ŞÖK** *sif.* Dik. *Xoşuna gəldimi Kürün kənarı? Gördünmü, gördünmü şök çinarları?* O.Sarıvəlli.

**ŞÖKƏ** *is.* Nazik çubuq dəstəsi. *Yolunan yeddi yaşında bir oğlan .. ayaqyalın, qabağına bir dəstə quzu qatıb və əlindəki şökə ilə bu quzuları vura-vura gəlir kəndə*. C.Məmmədquluzadə.

**ŞÖKLƏMƏK** *f.* Arxa ayaqlar üstündə oturmaq (it).

**ŞÖLƏ** *is.* [*ər.*] Alov, parıltı, işıltı, şəfəq. [Xortdan:] *Səhranın günbatan tərəfindən, gördüm, bir şölə asimanə bülənd olub*. Ə.Haqverdiyev. *Qaraca qızın sevgili şəlaləsi Günəşin qırmızı şöləsindən parlayırdı*. S.S.Axundov. *Aslanın gözlərində ani bir şölə parıldayıb söndü*. M.Hüseyn. ◻ **Şölə çəkmək** – alovla yanmaq, zəbanə çəkmək, alovlanmaq; işıq saçmaq. *Gəldi həm növ-növ şərbətlər; Şəmlər asimanə şölə çəkər*. S.Ə.Şirvani. [Qızıl qayada] *yer altından çıxan qaz, kim bilir, nə zaman bir yolçunun, bir ovçunun ya*

*bir çobanın çaxmaq daşından od alıb gecə-gündüz şölə çəkib yanır.* R.Rza. // Məc. mənada. *Alışıb şölə çəkib suz ilə yandım, gördüm; Hicrini atəşi-niyran dedilər, gərçək imiş.* S.Ə.Şirvani. **Şölə vermək (saçmaq)** – qızarmaq, allanmaq; parıldamaq, işıldamaq, şölələnmək, işıq saçmaq. *Başına dönüm, ay saqi; Doldur piyalədən yaxşı; Yanaqların şölə verir; Qırmızı lalədən yaxşı.* Aşıq Rəcəb. *Yer üzündə şölə saçır neçə min çıraq; Şəfəqlərin ağ sütunu ərşə toxunur.* S.Vurğun.

**ŞÖLƏCİK** "Şölə"dən *kiç. Bir şöləcik parlayıb söndü.*

**ŞÖLƏLƏNDİRMƏ** "Şölələndirmək"dən *f.is.*

**ŞÖLƏLƏNDİRMƏK** *f.* Alovlandırmaq, işıqlandırmaq, şəfəqləndirmək. *..Gün dağlara düşəndə günün şəfəqi dağların gah bu tərəfini şölələndirib, o tərəfinə qara kölgə salır, gah da əksinə.* C.Məmmədquluzadə.

**ŞÖLƏLƏNMƏ** "Şölələnmək"dən *f.is.*

**ŞÖLƏLƏNMƏK** *f.* Şölə saçmaq, alovlanmaq, alışıb-yanmaq, işıqlanmaq, işıq vermək, şəfəqlənmək. *Yenə od tutdu dan yeri, yandı; Şöləlzndi üfüq, alovlandı.* A.Səhhət. *Düz stolun üstündən ləmpədən asılmış onluq lampa şölələnirdi.* B.Bayramov.

**ŞÖNGÜMƏ** "Şöngümək"dən *f.is.*

**ŞÖNGÜMƏK** *f.* Çömbəlmək. *Alabaş quyruğu üstə şöngüyüb aram-aram hürür, gah da eyvanın altına tərəf soxulurdu.* B.Bayramov.

**ŞÖTDƏMƏ** "Şötdəmək"dən *f.is.*

**ŞÖTDƏMƏK** *f. dan.* Tez-tələsik tikmək. *Paltarın ətəyini şötdəmək.*

**ŞÖTÜK** *is. məh.* Dəvənin belinə bağlanan enli ip.

**ŞÖVKƏT** *is.* [*ər.*] Calal, dəbdəbə, ehtişam, həşəmət (klassik şeirdə bəzən tərkibdə "şövkəti-şan" şəklində işlənir). *Xublara vermişəm din-imanımı; Şövkəti-şanımı, ad və sanımı.* M.P.Vaqif. *Məndədir dəbdəbə, şövkət və hünər; Ulduzlu göylərə çəkmişəm əsgər.* A.Şaiq.

**ŞÖVKƏTLİ** *sif. tənt.* Əzəmətli, həşəmətli (padşahlara, hökmdarlara verilən ünvan). [Əsli:] *Ey şövkətli paşa, Kərəmə rəhmin gəlsin.* "Əsli və Kərəm". *At oynatdı kuyində hər cahangir bir kərə; Ərəb meydan oxudu şövkətli qeysərlərə.* Ə.Cavad. // Cah-calal sahibi, dövlət sahibi.

**ŞÖVQ** *is.* [*ər.*] 1. Şiddətli meyil, həvəs, arzu, istək. [Nuxulular] *Molla İbrahim Xəlili bu halət ilə görməkdən vəch edib, şövqdən qayəm sövt ilə çağırırlar.* M.F.Axundzadə. [Tahirzadə:] *Məsmə bacı, qızın oxumağa çox can atır, çox şövqü var.* Mir Cəlal. ☐ **Şövqə gəlmək** – həvəsə gəlmək, vəcdə gəlmək, ilhama gəlmək, ruhlanmaq. ..[Əmiraslan] *şövqə gəlib sazını götürər, süzə-süzə çalardı.* S.Rəhimov. **Şövqə gətirmək** – həvəsləndirmək, şövqləndirmək, vəcdə gətirmək, ruhlandırmaq, ilhamlandırmaq. *Qanuni-əsasi arvadları o dərəcədə şövqə gətirib ki, dəxi gözləri naməhrəm kişiləri görmür.* C.Məmmədquluzadə.

2. İşıq. *Eləmi sözü xoş; Kəmalı xoş, özü xoş; Aldı gözüm şövqünü; Xumar baxan gözü xoş.* (Bayatı). *Ay kimi şövq salıb ayna qabağın; Çoxların eyləyib divanə, Telli!* Aşıq Ələsgər.

**ŞÖVQLƏ** *zərf* Böyük həvəslə, ruh yüksəkliyilə, vəcdlə, ürəklə, ilhamla, sevə-sevə. *Şövqlə oxumaq. Şövqlə işləmək. Tamaşaya şövqlə baxmaq. – Vəfasızdır, könül, hər kim əsirgər canı canandan; Gərək canan yolunda keçsin aşiq şövqlə candan.* Ə.Vahid.

**ŞÖVQLƏNDİRİCİ** *sif.* Həvəsləndirici, ruhlandırıcı.

**ŞÖVQLƏNDİRMƏ** "Şövqləndirmək"dən *f.is.*

**ŞÖVQLƏNDİRMƏK** *f.* Şövqə gətirmək, ruhlandırmaq, həvəsləndirmək, ilhamlandırmaq. *Atası Fərmanın oynamasına və dülgərlik həvəsinə düşməsinə mane olmaz, əksinə, onu şövqləndirərdi.* Ə.Sadıq.

**ŞÖVQLƏNMƏ** "Şövqlənmək"dən *f.is.*

**ŞÖVQLƏNMƏK** *f.* Şövqə gəlmək, bərk həvəslənmək, həvəsə gəlmək, vəcdə gəlmək, ilhama gəlmək, ruhlanmaq.

**ŞÖVQLÜ** *sif.* 1. Şövqü, həvəsi olan; şövqə, həvəsə gəlmiş; bir şeyin şövqündə, həvəsində, arzusunda olan, həvəsli.

2. Şən, nəşəli, keyf içində olan.

**ŞÖVQSÜZ** *sif.* və *zərf* Həvəssiz, könülsüz, ruhsuz, istəmədən. *Şövqsüz işləmək.*

**ŞPAL** *is.* [*rus.*] Dəmir yollarında relslərin altına düzülən ağac, metal və ya beton tir.

**ŞPAT**[1] *is.* [*alm.*] Silikatlar turşusundan olan müxtəlif mineralların adı.

**ŞPAT**[2] *is.* [*alm.*] Atın ayaq sümüklərinin iltihabı.

**ŞPİK** *is.* [*rus.*] Donuz piyi.

**ŞPİNDEL** *is.* [*alm.*] Metalkəsən dəzgahın hərlənən vərdənəsi (valı).

**ŞPİNEL** *is.* [*alm.*] Növlərindən biri qiymətli daş sayılan minerallar qrupu.

**ŞPİÓN** [*alm.*] Casus. [Vəli:] *Bu nə sözdür, biz məgər şpionuq?* Ə.Haqverdiyev. *Darülfünun binası ətrafında atlı və piyada polis nəfərləri qoyulmuşdu.* [Polis məmurları] *tələbələr içərisinə şpionlar göndərmişdilər..* T.Ş.Simurq.

**ŞPİONLUQ** *is.* Casusluq. *..Bir para müsəlman müəllimlərinin canına bir cin müsəllət olub ki, yoldaşları öz aralarında hər nə deyir, danışırlarsa, haman cin gedib qorodovoya .. xəbər verir; yəni şpionluq edir*. C.Məmmədquluzadə.

**ŞPLİNT** *is.* [*alm.*] Tən ortadan əyilmiş məftil, mil.

**ŞPON** *is.* [*alm.*] *poliq.* Yığılan mətni səhifələrə ayırarkən sətirlər arasındakı məsafəni artırmaq üçün işlədilən boşluq materialı.

**ŞPRİS** [*alm.* Spritze] Dəri altına dərman yeritmək, həmçinin dəri altından mayeni sorub çəkmək üçün içiboş iynəli cərrahiyyə aləti. *Masanın üstündə tənziflə örtülü şprislər, pinsetlər .. vardı*. Ə.Əbülhəsən.

**ŞPROT** *is.* Siyənəkkimilər fəsiləsindən xırda balıq növü.

**ŞPUR** *is.* [*alm.*] *tex.* 1. Partladılması nəzərdə tutulan süxurlarda açılan dar deşik.

2. Əridici sobalarda maye axıtmaq üçün deşik.

**ŞRAPNÉL** [*ing.*] Düşmənin canlı qüvvəsini məhv etmək üçün içi yumru güllələrlə doldurulmuş top gülləsi. *Şrapnellər cavab verdi;* "*Bala*" *deyən anaların səsinə*. R.Rza. [Əsgər] *.. elə o dəqiqə gözləmədiyi bir amansız şrapnel və sağdan isə pulemyot və silah atəşi altına düşmüşdü.* Ə.Əbülhəsən.

**ŞRİFT** [*alm.*] *poliq.* Müxtəlif ölçü və biçimdə olan mətbəə hürufatı.

**ŞTAB** [*alm.*] Hərbi hissələrdə, birləşmələrdə qoşunları idarə edən orqan, habelə həmin orqanın tərkibinə daxil olan şəxslər; qərargah. *Qoşun keçdikdən çox sonra qoşun komandanı .. öz ştabı ilə gəlib keçdi.* M.S.Ordubadi. *Cavad əsirlərdən bir-iki məlumat öyrəndikdən sonra onları ştaba göndərib, yenə ehtiyatla yoluna davam etməyə başladı*. Ə.Vəliyev.

**ŞTABEL** *is.* [*alm.*] Tikinti materiallarının nizamla yığımı.

**ŞTAMM** *is.* [*alm.*] Morfoloji və fizioloji xüsusiyyətləri öyrənilmiş müəyyən mikroorqanizm növünün təmiz becərilməsi, yetişdirilməsi.

**ŞTAMP** [*ital.*] 1. İdarənin, müəssisənin və s. adı olan möhür. *Süleyman .. kağızları da və ştampı da guya bilmədən yerə tökür.* M.İbrahimov. // Vurulan ştampın izi, yeri. // *məc.* Damğa.

2. *tex.* Ştamplama yolu ilə standart detallar (hissələr) və ya başqa şeylər hazırlamaq üçün metal qəlib.

3. B a x **basmaqəlib** 1-ci mənada.

**ŞTAMPÇI** b a x **ştamplayıcı**.

**ŞTAMPLAMA** "Ştamplamaq"dan *f.is.* *Ştamplama sexi.*

**ŞTAMPLAMAQ** *f.* 1. Ştamp (2-ci mənada) vasitəsilə hazırlamaq.

2. Ştamp (1-ci mənada) vurmaq. // *məc.* Damğa vurmaq.

**ŞTAMPLANMA** "Ştamplanmaq"dan *f.is.*

**ŞTAMPLANMAQ** *məch.* 1. Ştamp (2-ci mənada) vasitəsilə hazırlanmaq. *Qazıma qıfıllarının hər iki hissəsinin içiboş şəkildə pəstahısı ştamplanır.* Ə.Mustafayev.

2. Ştamp (2-ci mənada) vurulmaq. // *məc.* Damğa vurulmaq.

3. *məc.* Basmaqəlib edilmək, tez-tələsik, başdansovma hazırlanmaq, görülmək.

**ŞTAMPLAYICI** *is.* Ştamp (b a x **ştamp** 2-ci mənada) vasitəsilə məmulat hazırlayan fəhlə.

**ŞTAMPLI** *sif.* Ştamp vurulmuş, ştampı olan. *..Partizanların ştamplı .. blankları da ələ keçə bilər*. Ə.Əbülhəsən.

**ŞTANQ** [*alm.*] 1. Bir çox alətlərdə, mexanizmlərdə detal kimi istifadə edilən metal ox. *Qazıma ştanqı. – Vışkanın təpəsindən bucurqada sarınan kanatı keçirmək üçün bir blok asılır və dəmir ştanqlara bağlanmış balta quyuya endirilib qaldırılır*. S.Quliyev.

2. *idm.* Ağır atletikada (ağırlıq qaldırmaqda) işlənən, hər iki başına taxılıb çıxarıla bilən disklər bərkidilmiş metal alət.

**ŞTANQİST, ŞTANQÇI** *idm*. Ştanq qaldırmaqla məşğul olan idmançı. *Ştanqçılar komandası. Ştanqistlərin yarışı.*

**ŞTÁPEL** [*alm.* Stapel] Süni və ya sintetik lif və bu lifdən toxunan parça.

**ŞTAT**[1] [*alm*. Staat] Bəzi burjua federativ dövlətlərin tərkibində müəyyən dərəcədə özü-özünü idarə edən dövlət ərazi vahidi. *Amerika Birləşmiş Ştatları* (dövlət adı). *Avstraliya ştatları.*

**ŞTAT**[2] [*alm*. Staad] Bir idarə və ya müəssisədə çalışan işçilərin sabit heyəti. *Ştatları ixtisar etmək. Ştat cədvəli. Ştatda on işçi var.*

**ŞTATDANKƏNAR** *sif.* Ştata daxil olmayan, ştatda nəzərdə tutulmayan, ştat xaricində. *Ştatdankənar işçi.*

**ŞTATÍV** *is.* [*alm.*] 1. Fotoqrafiya, geodeziya və s. aparatlarını bərkitmək üçün açılıb-bağlanan üçayaqlı səyyab vasitə.

2. ıLaboratoriya aparatı və qablarını bərkitmək üçün şaquli dayaq.

**ŞTATLI** *sif.* Ştatda olan, ştatda nəzərdə tutulan. *Ştatlı işçi. Ştatlı vəzifə.*

**ŞTÉMPEL** [*alm.*] Üzərində qabarıq şəkil və ya yazı olan möhür, damğa.

**ŞTÉPSEL** [*alm.*] Elektrik cihazlarını (məs.: lampanı, qızdırıcı cihazları və s.) elektrik xəttinə calamaq üçün haçaşəkilli metal alət.

**ŞTİFT** *is.* [*alm.*] Detalları birləşmək üçün işlədilən silindr mil.

**ŞTOF** *is.* [*alm.*] Mebel üzünə çəkmək və ya pərdə üçün ağır yun və ya ipək parça.

**ŞTOK** *is.* [*alm.*] Dağ süxurlarının böyük kütləsi.

**ŞTÓPOR** *is.* [*alm.*] 1. Burğulu butulka açan.

2. Təyyarə ilə vintvari xətt üzrə sürətlə başı aşağı enmə üsulu.

**ŞTREK** *is.* [*alm.*] Yeraltı yol.

**ŞTRİX** *is.* [*alm.*] 1. Cizgi.

2. Xüsusiyyət, səciyyəvi cəhət.

**ŞTÚRMAN** [*holl.*] Sualtı və suüstü gəmiləri, təyyarələri, dirijablları idarə edən mütəxəssis.

**ŞTURVAL** *is.* [*holl.*] Gəmidə, təyyarədə sükan.

**ŞUĞUL**[1] 1. B a x **şüvül**.

2. Tarazlıq oxu. *Laboratoriyada kimyəvi-texniki tərəzilərin daimi yeri olur və bunların yerini tez-tez dəyişdirmək yaramaz. Bu tərəzilərdə olan şuğul, onları duracağı yerdə düzgün yerləşdirməyə imkan verir.* C.Zülfüqarlı.

**ŞUĞUL**[2] b a x **çuğul**. [Qoca:] *O dünyada da elənçi şuğulları heç kəs içərisinə qoymur, burnuna vurub qovur.* S.Rəhimov. // Bəzən "şeytan-şuğul" şəklində işlənir. [Xalıqverdi:] *Mənim haqqımda deyilənin hamısı şeytan-şuğul sözüdür.* Ə.Vəliyev.

**ŞUĞULLUQ** b a x **çuğulluq**. *Yasavul .. Talıbxanın xidmətində özünün şuğulluğu ilə xüsusi məharət göstərir*(*di*). S.Rəhimov.

**ŞUX** *sif.* [*fars.*] 1. Şən, xoştəbiət, xoşədalı, işvəli, oynaq. *Gözlərin şuxdu sənin; Kirpiyin oxdu sənin; Dərdin məni öldürür; Xəbərin yoxdur sənin.* Sarı Aşıq. *Ta ki xəbər gəldi xublar şuxundan; Əl çəkdim cahanın varı-yoxundan.* M.V.Vidadi. *Fəxrəddinin diqqət-nəzərini gözəl və şux bir qız cəlb etdi.* M.S.Ordubadi.

2. *məc.* Nəzərəçarpan, ürəkaçan, parlaq. *Şux rəng.* – [Şəbbu:] *Gər yox isə sevimli rəngim mənim; Şux deyildirsə də həngim mənim; Ətrim uzaqdan bürüyür aləmi.* A.Səhhət. ..[Qumru] *hansı tərəfə dönürdüsə, daha şux bir rəng gözlərini oxşayıb, onu özünə doğru çağırırdı.* Ə.Məmmədxanlı.

**ŞUXLUQ** *is.* 1. Oynaqlıq, şivəlilik, nazlılıq, gülərüzlülük; naz, şivə, sərbəst və nazlı hərəkət. *Həmzəyə həmişəki kimi, yenə də Sonanın bu şuxluğu çox xoş gəldi.* Ə.Əbülhəsən.

2. Qəşənglik, incəlik, zəriflik, məlahət. [Qızların] *əndamına şuxluq verən xüsusiyyətlərdən birisi də boyunlarının ağlığı və uzunluğudur.* M.S.Ordubadi. *Quşun tüklərinin oynaqlığını, şuxluğunu, zərifliyini, bir sözlə, gözəlliyini təsvir etməyə nə mövcud rənglər, nə məlum kəlmələr kifayət etməz.* M.Rzaquluzadə.

3. *məc.* Zarafat. □ **Şuxluq eləmək** – zarafat eləmək, əylənmək. [Pəri:] *Şuxluq edirəm, Bəhram, Sara harada olursa, bizə mane ola bilməyəcək.* C.Cabbarlı. *Usta Kazım Azadı öz övladı kimi istəyir, onunla danışanda şuxluq eləyirdi.* S.Rəhman. **Şuxluğa salmaq** – zarafata salmaq. [Kişi] *söz arasında çox zaman şuxluğa salıb ruhanilər əleyhinə təbliğat aparırdı.* Ə.Haqverdiyev.

**ŞULUQ** *sif.* 1. Nadinc, dəcəl, şuluqçu. *Şuluq uşaq.*

2. *is.* Dələduz. *Yoluğun nəyi var, şuluğa versin.* (Ata. sözü).

3. *is.* Hərc-mərclik, qarışıqlıq, qalmaqal, qayda-qanunsuzluq. [Məmmədəli:] *Güləndam, itin olum, küçüyün olum, bu ev çox şuluqdur, aman günüdür.* N.Vəzirov. *..Məsciddə*

*şuluq başlandı..* M.S.Ordubadi. □ **Şuluq salmaq** – qarışıqlıq salmaq, qarışdırmaq, pozğunluq salmaq, iğtişaş salmaq, qayda-qanunu pozmaq. [Bülənd:] *Dövlət yazır ki, Veys şuluq salıb, beş-on adam tutdurub*. Ə.Əbülhəsən.

◊ **İş şuluqdur** – iş əngəldir, yaxşı deyil, içindən xata çıxacaq. [Süleyman:] *Sənin işin şuluqdur*. M.İbrahimov. [Kişi:] *Bala, bu işlərin axırı şuluqdur.* Qantəmir.

**ŞULUQÇU** *sif.* və *is.* 1. Şuluq eləyən, nadinc, dəcəl. *Şuluqçu uşaq*. – [Sabir:] *Bizdə bir Məmmədağa var, çox yaman şuluqçudur*. S.Rəhimov.

2. Dələduz, qalmaqalçı, araya şuluqluq-salan. *Şuluqçu adam.*

**ŞULUQÇULUQ** b a x **şuluqluq**.

**ŞULUQLUQ** *is.* 1. Nadinclik, dəcəllik. *Şuluqluq eləmək.*

2. Hərc-mərclik, araqarışma, qarışıqlıq, çaxnaşma, iğtişaş, özbaşınalıq. // Qovğa, mərəkə, həngamə, qarışıqlıq. *Bəzən yerbəyerdən mütrübü çağırardılar. Şuluqluq başlanardı*. H.Sarabski. [Cavan oğlan:] *Şuluqluqdan qardaş qardaşı itirir.* Mir Cəlal. □ **Şuluqluq düşmək** – ara qarışmaq, qayda, nizam pozulmaq, çaxnaşma düşmək. *Hamı yığılır.* "*Nə oldu, nə oldu!*" *deyib, aralaşdırırlar, şuluqluq düşür.* Ü.Hacıbəyov. **Şuluqluq salmaq** – aranı qarışdırmaq, qarışıqlıq salmaq, qalmaqal salmaq, nizamsızlıq törətmək. [Mirzə Cəmil] *xeyli düşünüb-daşınandan sonra bu qərara gəldi ki, fəhlələr arasında şuluqluq salan Ataşdır*. Ə.Vəliyev. *Ucqar stansiyalarda şuluqluq salan silahlı hərbçilərə rast gəlmək olar*. Ə.Əbülhəsən.

**ŞULUM** *sif. məh.* Pinti, səliqəsiz.

**ŞUM**[1] *sif.* [*ər.*] *klas.* Uğursuz, məşum, nəhs, bədbəxtlik gətirən. [Zəhra Sənana:] *Məndə, bilməm, nədir bu talei-şum! Sana halım deyilmidir məlum?* H.Cavid. [Mirzə Əliəkbər:] [Bu ruznamə] *düşmənlərimizin şum niyyətini daha tez ifşa edə bilər.* P.Makulu.

**ŞUM**[2] *is.* Şumlanmış torpaq. *Yaz şumu. Payız şumu. – Şumdan qabaq ..hər hektara 5 kiloqram fosfor gübrəsi verilmişdi.* Ə.Əbülhəsən. □ **Şum eləmək** – şumlamaq. *Taxıl yerin şum eyləyib əkin əkər əkinçilər; Əlində dəryaz ot biçər mayis ayı biçinçilər.* A.Səhhət. *Hələ öhdəçilikdən əlavə şum eləyənlər də vardı.* M.Hüseyn.

◊ **Dondurma şumu** – b a x **dondurma**[1].

**ŞUMAL** *sif.* 1. Hündür, düz, sərrast. *Şumal çinar. Şumal ağac. – Tikildi divarlar, şumal dirəklər*. M.Müşfiq. [Yunis:] *Bu taxta qurudur, şumaldır*. Mir Cəlal.

2. *məc.* Ucaboy, boy-buxunlu, təndürüst, qədd-qamətli. *Şumal oğlan. Şumal qız. – Aşağı tərəfdə samovarın yanında ev xanımı oturmuşdu. İrigözlü, uzunkirpikli şumal bir qız çay fincanları(nı) düzməkdə idi*. Çəmənzəminli. *Heybət qabaqdakı qıvrımsaçlı, qarayanız, şumal oğlana müraciət elədi.* M.Hüseyn.

**ŞUMALTI** *sif. k.t.* Şumlanmış torpağın alt qatı. *Şumaltı lay*.

**ŞUMLAMA** "Şumlamaq"dan *f.is.*

**ŞUMLAMAQ** *f.* Torpağı kotanla sürmək, şum eləmək, yumşaltmaq. *Cütçü batıb qantərə, yer şumlayır; Şumladığı tarlasını şumlayır.* M.Ə.Sabir. *Gülşən briqadirin yanına gedib, tələb etdi ki, onun sahəsini yenidən şumlasınlar.* Ə.Vəliyev.

**ŞUMLANMA** "Şumlanmaq"dan *f.is.*

**ŞUMLANMAQ** *məch.* Şum edilmək. *Maya ətrafda şumlanaraq payız əkinləri üçün hazırlanmış tarlaların arxlarını yoxladı*. M.İbrahimov.

**ŞUMLANMIŞ** *f.sif.* Şum edilmiş. *Traktorla şumlanmış zəmi. – Qızlar belləri qapıb təzəcə şumlanmış sahənin traktor tuta bilməyən qırağını belləməyə başladılar.* M.İbrahimov.

**ŞUMLUQ** *is.* Şum edilmiş, şumlanmış yer.

**ŞUR**[1] *is.* [*fars.*] Azərbaycan klassik muğamlarından birinin adı. "*Rast*", "*Şur*", "*Segah*", "*Şüştər*", "*Çargah*", "*Bayatı-Şiraz*" və "*Humayun*" *Azərbaycan musiqisinin yeddi əsas ladıdır.* Ü.Hacıbəyov. [Ağai-Füzulüzzakır:] *..neçə dəfə səyahətdə bizim üçün öz segahları ilə, şurları ilə, xüsusən bayatı-qacarları ilə ləzzəti-ruhani veribdir.* Ə.Haqverdiyev.

**ŞUR**[2] *is.* [*fars.*] 1. Vəcd, şövq, cuşa gəlmə; coşqunluq. *Dili-divanə sevər cantək o zülfi-siyəhi; Başının şurini gör, eşqdə sevdasına bax.* S.Ə.Şirvani. *Məcnun öz şurilə çox da aləmə səs salmasın; Hansı namərd can əsirgər bir nigarın eşqinə?* S.Vurğun. // Gurultu, patırtı. □ **Şur etmək** – b a x **şur salmaq**. **Şur salmaq** – səs-küy salmaq, gurultu qoparmaq. **Şura gəlmək** – vəcdə gəlmək, cuşa

gəlmək, ruhlanmaq, şövqlənmək. *Tarçı şura gələr tarı görəndə.* M.Rahim. **Şura gətirmək** – vəcdə gətirmək, cuşa gətirmək, ruhlandırmaq. *Pərini almaq həvəsi onu tamam şura gətirmişdi.* Ə.Əbülhəsən.

2. "ilə" qoşması ilə – vəcdlə, həvəslə, şövqlə, ruh yüksəkliyi ilə. *Çıxdı günəş, doldu cahan nur ilə; Cütçü sürür tarlada cüt şur ilə.* M.Ə.Sabir. *Ötürdü şaxədə şur ilə bülbül.* M.Rahim.

**ŞURA** *is.* [*ər.*] 1. Hər hansı bir məsələni, işi və s. müzakirə etmək, məsləhətləşmək üçün bir yerə yığışma; müşavirə, məclis. *Valideynlər şurası.*

2. Hər hansı bir təşkilat, idarə, cəmiyyət yanında sərəncamverici və ya məşvərətçi orqan. *İnstitutun elmi şurası. Həmkarlar İttifaqları Şurası. – Rüstəm dönüb atını çəkmək istərkən, Qəhrəman pedaqoji şuranın üzvlərilə içəridən çıxdı.* S.Rəhimov. [Zakirov:] *Flora, elmi şura üzvləri gəliblər?* Ə.Məmmədxanlı. ☐ **Şura etmək** – iclas çağırmaq, məclis qurmaq, yığışıb məsləhətləşmək.

3. B a x **Sovet** (bəzən cəm şəklində: şuralar). *Şura katibi Məmmədəli də asudə, fikirsiz-zikirsiz gəlib dəftərxananın sol küncündə öz yerində oturdu.* B.Talıblı. *Şuralar hökumətində qadınlara zülm və cəbr edənlərin yeri həbsxanadır.* S.Hüseyn. [Kərim:] *..Şuranın qurulmağından on il keçir,* [Ərşad] *niyə gətirib tüfəngi hökumətə təhvil verməyib?* İ.Əfəndiyev.

4. Seçilmiş və ya təyin olunmuş şəxslərdən ibarət olub, dövlət, yaxud onun hər hansı bir sahəsində rəhbər rol oynayan bəzi dövlət orqanlarının adı. *Müdafiə şurası. Xalq təsərrüfatı şurası.*

**ŞURALAŞMA** "Şuralaşmaq"dan *f.is.* b a x **sovetləşmə**.

**ŞURALAŞMAQ** b a x **sovetləşmək**. *Ölkəmiz şuralaşanda Mirzə Mustafa üzünə pərdə çəkib qırmızılaşdı, özünü kommunist qələmə verdi.* E.Sultanov. [Hacı:] *Bu il aprel də gəlsə, düz on il olur ki, Azərbaycan şuralaşıbdır.* Qantəmir.

**ŞURƏVİ** *sif.* [*ər.*] *tar.* Sovetlərə, sovetlər ölkəsinə, sovet adamlarına xas və aid olan. *Şurəvi qardaşlar, bizim sözlərimizi eşidin və şura fəhlələrinə yetişin.* M.İbrahimov.

**ŞURF** *is.* [*alm.*] Mədən yataqları tapmaq üçün qazılan quyu.

**ŞURİŞ** *is.* [*fars.*] Qarışıqlıq, qarğaşalıq, iğtişaş, şuluqluq. *Qazax mahalının vəkili Pənah ağanın zamanında bir para şuriş və inqilabın vüquinə görə Qazax mahalından bir neçə elat keçib Qarabağ vilayətinə, İbrahim xanın təhti-himayəsinə gediblər.* F.Köçərli. [Mozalan bəy:] *Ay Allah, İranın bu şuriş vaxtında, görəsən, başıma nə müsibətlər gələcək..* Ə.Haqverdiyev. ☐ **Şuriş düşmək** – qarışıqlıq, qarğaşalıq düşmək, iğtişaş qalxmaq, ara qarışmaq. *Kənddə şuriş düşdü.* C.Məmmədquluzadə. [Vəzir:] *Sus! Öylə söz demə, yoxsa camaat xəbərdar olsa, haman dəm şuriş düşər.* Ü.Hacıbəyov. **Şuriş salmaq** – 1) qarışıqlıq salmaq, qarğaşalıq salmaq, aranı qarışdırmaq, iğtişaş salmaq, şuluqluq törətmək. *Müdir* [Qurban Mərəndini] *vətənpərəstlik hisslərini itirməkdə və şuriş salmaqda ittiham etdi.* M.İbrahimov; 2) səs-küy salmaq, gurultu salmaq. *Gəlin, indi nəğməni başdan çalaq; Dağa, daşa, səhraya şuriş salaq.* A.Səhhət.

**ŞURUP** *is.* [*alm.*] Burğulu mıx, vint.

**ŞÜA** *is.* [*ər.*] 1. Günəşdən və başqa bir işıq mənbəyindən çıxan işıq telləri. *Günəş şüası. İşıq şüası. – İlk baharın yeni həyatverici günəşi, özünün ılıq və munis şüasını ətrafa saçmaqla qışın bıqdırıcı və soyuq havasına qələbə çalmaqda idi.* S.Hüseyn. *Günəşin şüaları qüvvədən düşmüş və yayda saçdığı hərarəti verməkdən aciz idi.* T.Ş.Simurq.

2. *xüs.* Adətən cəm şəklində. Hər hansı enerjinin yayılma xətti. *Rentgen şüaları. İstilik şüaları. Radium şüaları.*

◊ **Şüa xəstəliyi** – radioaktiv maddələrin orqanizmə təsiri nəticəsində törəyən xəstəlik.

**ŞÜALANDIRMA** "Şüalandırmaq"dan *f.is.*

**ŞÜALANDIRMAQ** *f.* 1. Şüa buraxdırmaq, şüa saçdırmaq.

2. *fiz.* Radioaktiv elementlərin təsirinə məruz buraxmaq.

**ŞÜALANMA** *is.* 1. "Şüalanmaq"dan *f.is.*

2. *fiz.* Radioaktiv elementlərin şüaburaxma xassəsi.

**ŞÜALANMAQ** *f.* Şüa buraxmaq, şüa saçmaq, şüa vermək. *Elektrik aparatlarında sərbəst elektronlar mənfi kontaktın səthində şüalanır.* P.Rüstəmzadə.

**ŞÜALI** *sif.* Şüaburaxan, şüaverən, şüası olan. *Şüalı ulduz.*

**ŞÜAR** *is.* [*ər.*] 1. Siyasi partiyanın müəyyən tarixi şəraitdə kütlələr qarşısında irəli sürdüyü rəhbər ideyanı, vəzifəni və ya tələbi qısa və aydın şəkildə ifadə edən müraciət; çağırış. // Üstündə belə çağırış sözləri olan plakat. *Nümayişçilərin əllərində şüarlar irəliləyirdilər.*

2. *məc.* Bir şəxsin məsləkini, hərəkət tərzini, məqsəd və ya tələbini ifadə edən kəlam və ya ifadə. *Hacı Rüstəmin həmişə şüarı bu idi:* "*Fürsəti fövt eyləməz aqil, məgər nadan ola*". Ə.Haqverdiyev. *Oxumaq, qazanmaq, sərvət sahibi olmaq* [Qulunun] *birinci şüarı idi.* Çəmənzəminli.

**ŞÜARÇILIQ** *is.* Əməli hərəkət, iş deyil, ancaq şüar irəli sürməklə kifayətlənmə. *..Cabbarlının əsərlərindəki ictimai fikir daha da dərinləşir, aktual mövzu şüarçılığa çevrilmir.* M.İbrahimov.

**ŞÜASAÇAN, ŞÜASAÇICI** *sif.* Şüaburaxan, şüayayan.

**ŞÜASAÇMA** b a x **şüalanma** 2-ci mənada.

**ŞÜAVARİ** *sif.* Şüayaoxşar, şüa kimi.

**ŞÜBHƏ** *is.* [*ər.*] Bir şeyin gerçəkliyinə xatircəm olmama, bir şeyin həqiqətə uyğun ola biləcəyi haqqında fikir, güman, şəkk, tərəddüd. [Nüşabə:] *Sənə qəlbimdə bir iman varıdı; Könlümü şübhə, tərəddüd sarıdı.* A.Şaiq. *Məlun şübhə Məmmədbağıra rahatlıq vermirdi.* S.Hüseyn. *Məşədi Şərifin ürəyi sakit olmur, şübhə, narahatlıq, təşviş onun yaxasından əl çəkmirdi.* Ə.Vəliyev. ☐ **Şübhə doğurmaq (oyandırmaq)** – şübhələndirmək, şübhəyə səbəb olmaq. *..Qızın yaxşı geyimi məndə şübhə oyandırdı.* M.S.Ordubadi. *..Leylək özünü düzəltməyə, izafi şübhə doğurmamağa, ağasının müqabilində gözükölgəli olmamağa çalışırdı.* S.Rəhimov. **Şübhə etmək** – bir şeyin gerçəkliyinə tam inanmamaq, xatircəm olmamaq, arxayın olmamaq. *Xəbərin düzlüyünə şübhə edirəm.* **Şübhə etməmək (eləməmək)** – inanmaq, xatircəm olmaq, arxayın olmaq. *Anam buna razı oldu, çünki ondan ayrılmayacağıma şübhə etmirdi.* S.S.Axundov. *Tahir Lətifənin aydın baxışlarındakı səmimiyyətə qətiyyən şübhə eləmirdi.* M.Hüseyn. **Şübhədən çıxartmaq** – inandırmaq, şübhə yeri qoymamaq. *Bir neçə gündən sonra görürsünüz varislər şübhədən çıxmaq üçün özləri gəlib azdan-çoxdan məşədiyə verib halallıq alırlar.* Ə.Haqverdiyev. **Şübhəyə düşmək** – şübhələnmək, şübhə əmələ gəlmək. [Axund:] *Amma indi ki siz deyirsiniz,* [Səriyyə] *razı deyil, ərz olsun, mən də şübhəyə düşdüm.* C.Cabbarlı. **Şübhəyə salmaq** – şübhə doğurmaq, şübhələndirmək. [Nigar:] *Koroğlu, bu qızın sözü məni şübhəyə salıb.* "Koroğlu". **Heç şübhə yoxdur ki...** – şübhəsiz, inanın, həqiqətən, gerçəkdən, yəqin. *Heç şübhə yoxdur ki,* [qız] *vəliəhdi sevdiyini demək istəyirdi, lakin buna cəsarət etmirdi.* M.S.Ordubadi. [Xəyyam:] *Varlığım bir heçə bənzər mübhəm; Heç var olmaz, buna yoxdur şübhəm.* H.Cavid.

**ŞÜBHƏLƏNDİRMƏ** "Şübhələndirmək"dən *f.is.*

**ŞÜBHƏLƏNDİRMƏK** *f.* Şübhə oyatmaq, şübhəyə salmaq, şübhə doğurmaq. *Onun haqqında eşitdiyi bəzi şeylər Büləndi Camaldan şübhələndirirdi.* Ə.Əbülhəsən.

**ŞÜBHƏLƏNMƏ** "Şübhələnmək"dən *f.is.*

**ŞÜBHƏLƏNMƏK** *f.* 1. Bir şeyin gerçək olub-olmadığını kəsdirə bilməmək, şübhə etmək, şəkk etmək, inanmamaq. *Seyid Əhməd mədaxili az görüb yoldaşından şübhələndi..* Ə.Haqverdiyev. *Mehriban şübhələnməyə başladı.* S.Hüseyn. *Vahid və Rübabəni tanıyanlar arasında elə adam yox idi ki, bu iki cavanın evlənəcəyinə şübhələnsin.* Mir Cəlal.

2. Gümanı getmək, güman etmək, zənn etmək. *Dağda dərviş gəzdiyini ömründə xəbər verən yox idi. Mən bundan şübhələndim.* A.Divanbəyoğlu. *Məhərrəm onun başqa bir aləmdən gəlmiş fövqəladə insan olduğuna şübhələnirdi.* H.Nəzərli.

**ŞÜBHƏLİ** *sif.* 1. Şübhə oyadan, şübhə doğuran, şübhəyə səbəb olan. *Şübhəli adam. Şübhəli məsələ. – Katibin yumşaq rəftarı Salmana bir cür gəlir, şübhəli görünür, qorxudurdu.* M.İbrahimov. *Mən diqqətlə ağaca baxıb qalın budaqların arasında şübhəli bir qaraltı gördüm.* M.Rzaquluzadə.

2. O qədər də inanılası olmayan, niyyəti, ləyaqəti, mənəvi keyfiyyətləri şübhə doğuran. *Şübhəli adam. Əxlaqı şübhəli.*

3. Hər şeyə şübhə ilə baxan, hər şeydən şübhələnən, son dərəcə ehtiyatlı. *Aydəmir bir qaçaqdır, hər bir şeydən şübhəli.* C.Cabbarlı.

**ŞÜBHƏLİLİK** *is.* Şübhəli olma, şübhəli şeyin halı.

**ŞÜBHƏLİ-ŞÜBHƏLİ** *zərf* Şübhəli halda, şübhə edircəsinə, şübhə ilə. *Bağban şübhəli-şübhəli Həcəri nəzərdən keçirtdi..* S.Rəhimov. *Mürsəl duruxa-duruxa, şübhəli-şübhəli pıçıldadı.* Ə.Vəliyev.

**ŞÜBHƏSİZ** 1. *zərf* Mütləq, şəksiz. *Şübhəsiz mən də gələcəyəm. Şübhəsiz bu gecə yola düşməliyik.* – [Gəray:] *Beləliklə o tabe olsa bizə; Şübhəsiz baş əyər hər əmrimizə.* A.Şaiq.

2. *ara s.* Əlbəttə, təbii. *O, şübhəsiz, doğru deyirdi. Şübhəsiz, mən onu təhqir etmək istəmirdim.* ◻ **(Heç) şübhəsiz ki, şübhəsizdir ki**... – yəqin ki, əlbəttə ki, görünür ki, yəqin ki. *Şübhəsizdi ki, Əhməd kişi də qızı dediyi sözləri deyəcəkdi.* M.S.Ordubadi. *Heç şübhəsiz ki, Zərdabiyə qarşı olan şiddətli, həyasız hücum, Seyid Əzim Şirvani kimi qüdrətli bir şair mövcud ikən, cavabsız qalmayacaqdı.* M.İbrahimov. [Məmmədov:] *Şübhəsiz ki, hamının işlədiyinə baxmayaraq, bu işlərdə* [Kərimovun] *böyük fəaliyyəti olmuşdur.* H.Seyidbəyli.

**ŞÜCAƏT** *is.* [*ər.*] İgidlik, rəşadət, cəsarət, cəngavərlik, qoçaqlıq, bahadırlıq, mərdlik. *Səxavət olmayan kəsdə şücaət feli nadirdir; Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.* M.V.Vidadi. [Vəzir:] *Leyla, bu nə halətdir? Sən hara, Harun hara. Harun şücaət və cəsarətdə ad qazanmış bir pəhləvandır.* Ü.Hacıbəyov. ◻ **Şücaət göstərmək** – hünər göstərmək, igidlik, qoçaqlıq eləmək. [Toğrul:] *Eh, çox böyük şücaət göstərmişsən.* C.Cabbarlı.

**ŞÜCAƏTLİ** *sif.* Cəsarətli, cəsur, bahadır, qoçaq, igid. *Övladları qeyrətlidir, damarlı; Şücaətli, hünərli, etibarlı.* A.Səhhət. [Nəcəf bəy Dilaraya:] *Şücaətli qardaşın bu gün hökumətin əmri ilə Bakı milyonerlərindən Ağabalayevi həbs eləmişdir.* Ə.Məmmədxanlı.

**ŞÜƏRA** *is.* [*ər.* "şair" söz. cəmi] *klas.* Şairlər. *Əgərçi Sədi və Hafizdən sonra İranda şeir qayətdə tənəzzülə düşüb, şüəranın əşarı küllən biməzmun və məhz puç ləffazlıq olmuşdu.* M.F.Axundzadə. *Seyyida, bunca ki məsciddən edirlər nifrət; Nə görüblər, görəsən kim, şüəra məsciddə?* S.Ə.Şirvani. *..Bizim şüəra cismən fövt olublarsa da, ruhən və mənən həlak olmayıblar.* F.Köçərli. [A.Səhhət] *gənc ikən şeirlə maraqlanaraq Seyid Əzimə təqlidən bir çox qəzəl yazmışdır. Ədəbi qaydanı, xüsusən, əruz vəznini Şamaxı şüəra və ürəfasından sayılan Hacı Cabbar Sabitdən öyrənmiş*(*di*).. A.Şaiq.

**ŞÜĞL** *is.* [*ər.*] *klas.* İş, məşğələ, məşğuliyyət. [Pəri xanım:] *A qadan alım .. sözümə qulaq as, o qədər şüğlüm var ki, səni görmək olmur.* M.F.Axundzadə. *Ər deyil, şair imiş xanəxərab; Fikri yazmaq, oxumaq, şüğlü kitab.* M.Ə.Sabir. [Səlimə nənə:] *Şüğlüm çoxdur; vaxt tapmayıram ki, gəlib səninlə söhbət edəm.* S.S.Axundov. // Əlləşmə, bir şeylə məşğul olma.

**ŞÜĞÜLZÜMMƏ** *is.* [*ər.*] *köhn. din.* Müsəlmanlıqda: Allah qabağında günahkarlıq, təqsirkarlıq. ◻ **Şüğülzümmə eləmək (etmək)** – günaha batırmaq, günahkar eləmək. *Mərhumun varisləri bir-birlərinin üzünə baxıb, ürəkləri yumşalmış hallarında ölülərini şüğülzümmə eləmək istəməyib pulları verirlər.* Ə.Haqverdiyev. **Şüğülzümmə olmaq** – günaha batmaq, günahkar olmaq.

**ŞÜHUDİ** *sif.* [*ər.*] *dilç.* Felin iki keçmiş formasından birinin adı. *Şühudi keçmiş.*

**ŞÜKKÜTMƏ** "Şükkütmək"dən *f.is.*

**ŞÜKKÜTMƏK** *f.* Qondurmaq, oturtmaq. [Səlim bəy:] *Amma indi... Bir çolaq yabını minirsən, bir quşu şükkütürsən barmağının başına, onun da bir gözü kor, bir gözü də məyub.* Ə.Haqverdiyev.

**ŞÜKRAN** *is.* [*ər.*] *klas.* Yaxşılıq bilmə, edilən yaxşılığa müqabil edilən minnətdarlıq, təşəkkür, şükür. *Sən azad eylədin qəmdidə hürriyyətpərəstanı; Sənə ləbrizi-şükrandır bütün əhrar, hürriyyət!* M.Hadi.

**ŞÜKRANƏ** [*ər.* şükr və *fars.* ...anə] *klas.* 1. B a x **şükran**. [Divanbəyi:] *Bari bu işin şükranəsinə nizama tabe olun, əyərçi heç nizamı və zabitəni anlamırsınız!* M.F.Axundzadə. // **Şükranla** şəklində – minnətdarlıqla, təşəkkürlə, dərin razılıq hissi ilə. *Ey əzizidilü can, ey fərəhi-qəlbi-məlul! Edərəm iştə bu təklifini şükranə qəbul.* A.Səhhət.

2. *is.* Təşəkkür, minnətdarlıq, razılıq əlaməti olaraq verilən şey.

**ŞÜKRLİLLAH, ŞÜKRÜLLAH** [*ər.*] *ara s.* Allaha şükür, xoşbəxtlikdən, bəxtimdən. *Mən*

*Vaqifəm, kuyin mənə Kəbədir; Şükrlillah, müsəllayə dönmüşəm.* M.P.Vaqif. *Şükrlillah, hər nə istərdim, mühəyyadır mənə.* Q.Təbrizi.

**ŞÜKUFƏ** *is.* [*fars.*] Gül, çiçək. *Baş çıxarmış şükufələr seyr elər; Yaşılına, o alına sevdiyim!* M.V.Vidadi. *Səba gətirdi genə müjdəyi-gülüstanı; Şükufələr açılır, fəsli-növbahar gəlir.* S.Ə.Şirvani. *Bəzəklənir, düzəklənir, bağın fəzası rənglənir; Yaşıllanır, həm allanır, şükufələr çiçəklənir.* A.Səhhət.

**ŞÜKUFƏLƏNMƏ** "Şükufələnmək"dən *f.is.*

**ŞÜKUFƏLƏNMƏK** *f.* Açılmaq, çiçəklənmək, zahir olmaq (gül haqqında). *Şükufələnmiş* (f.sif.) *güllər nəsimin dəyməsindən enib qalxdıqca Gülsümün vidasına cavabən* "*Get, Allah səni xoşbəxt eləsin!*" *deyirdilər.* Ə.Haqverdiyev.

**ŞÜKUH(Ə)** [*fars.*] *klas.* Böyüklük, ululuq, əzəmət, calal, həşəmət; şan-şərəf. *Bir təxtirəvan içində Leyli; Nə şövkətə, nə şükuhə meyli.* Füzuli. *Gərək küllən gedib, kəmali-şükuh və təntənə ilə* [Yusif Sərracı] *gətirib, bu təxtin üstündə oturdub müstəqillən özünü padşah biləsiniz.* M.F.Axundzadə. *Hər bir təkyə sahibi, təziyəsinin şükuhu üçün Sofi Hüseyni çağırmağı vacib bilərdi.* Ə.Haqverdiyev.

**ŞÜKUHLU** *sif. klas. köhn.* Təntənəli, əzəmətli, calallı; şan-şərəfli. *Toy çox şükuhlu* (z.) *keçdi.* Ə.Haqverdiyev.

**ŞÜKÜR** *is.* [*ər.*] Edilən yaxşılığa qarşı minnətdarlıq, təşəkkür, razılıq ifadəsi. [Kərbəlayı Məhəmməd:] *Pərvərdigara! Səndən üzülməyənə heç zad olmaz imiş. Sənə min şükür! – deyib, əlini ustanın toqqasına atdı.* Çəmənzəminli. [Əli əmniyyəbaşı:] *Bir gecəlik qonağıq, ev sahibi nə versə, ona da şükür.* M.İbrahimov. ☐ **Şükür (şükür-səna) etmək (eləmək, qılmaq)** – razılıq etmək, minnətdarlığını bildirmək, təşəkkürünü ifadə etmək, razılığını bildirmək. *Birini gör, fikir elə; birini gör, şükür elə.* (Ata. sözü). *Mehman kişi qızının gözlərinə diqqətlə baxdığı vaxt Qəmərin ürəyi dağ boyda olur, qəlbən fərəhlənir, sürdükləri asudə həyat üçün şükür-səna edirdi.* Ə.Vəliyev.

◊ **Şükür Allaha (Tanrıya, Yaradana və s.)** – 1) yaxşı ki oldu, xoşbəxtlikdən, bəxtimizdən (bəxtinizdən). [Xəstə sövdagər:] *Şükür olsun Allaha, şəfa tapdım, daha canımda bir dərd qalmadı.* E.Sultanov; 2) razılıq, minnətdarlıq, təşəkkür ifadəsi. [Sənəm:] *Nə üçün, şükür Allaha, yaxşıyam.* Ü.Hacıbəyov. [Qurban:] *Nə deyim, haqqın kərəminə şükür.* Ə.Haqverdiyev. [Ana:] *Oğlumu evləndirəndə, onun arvadına* [hamayili] *bağışlayaram. Nə eləyim? Şükür dərgahına, qismət deyilmiş.* B.Talıblı. **Şükür (şükürlər) olsun!** – b a x **Allaha şükür!** *Hədsiz şükürlər olsun dünyada gördüyüm günlərə!* C.Məmmədquluzadə. [Həsənağa:] *Şükürlər olsun, gəldikcə ziyalılarımızın sayı artır, onları bir göndər yanıma, gəlsinlər bir söhbət edək.* Ə.Haqverdiyev. *Şükür olsun ki, hazırda ixtiyar əlimizə keçmişdir.* M.S.Ordubadi.

**ŞÜLƏ** *is. məh.* Hər iki tərəfə uzadılmış qolların arasındakı məsafə (şərti uzunluq ölçüsü).

**ŞÜLƏK** *is.* Parça zolağı, parça topu. *Pəncərədən düşən işıq ağ ipək şüləyi kimi uzanıb, Muradın sol döşünə yayılmışdı.* Ə.Vəliyev. *Bircə dəqiqənin içində qırmızı şüləklər qollara bağlandı.* Ə.Əbülhəsən.

**ŞÜLƏKLƏMƏ** "Şüləkləmək"dən *f.is.*

**ŞÜLƏKLƏMƏK** *f.* Şülək halına salmaq, sarıyaraq top halına salmaq. *Parçanı şüləkləmək. – Veys özü izah etdi: – Bu qırmızı şüləni Həmzənin dükanından götürmüşəm, – parçanı şüləkləməyə başladı.* Ə.Əbülhəsən.

**ŞÜMAL** *sif.* 1. Yeni dikəlib göyərən budaq, zoğ. *Çəkil şümalı. – Bir şümal pöhrəni; Bir vurğuda qələm elədi; Və qürurla dedi; Ovxarını gördünmü baltanın?* R.Rza.

2. Düz, hamar. *Sahildəki şümal və ziləv daşların bir parası yuyulub təmizləndikdən sonra daha parlaq görünür.* Ə.Vəliyev. *Yunis bıçağa işarə etdi: – Yaxşı itilənsə, yüz əlli ödəyərsən. Bu taxta qurudur, şümaldır.* Mir Cəlal.

3. *məc.* Yeniyetmə, boylu-buxunlu. *Məmməd bəy on iki-on üç yaşında alagözlü, qumralsaçlı, genişkökslü, şümal bir oğlandı.* Çəmənzəminli.

**ŞÜMAR** *is.* [*fars.*] Say, hesab. ☐ **Şümara gəlməmək** – saya, hesaba gəlməmək. *Məkani-əslimdən düşdüm avarə; Dərdimin ədədi gəlməz şümarə.* Aşıq Baxış.

**ŞÜMARƏ** *is.* [*fars.*] *köhn.* Əqrəb (saatda). *Saatı çıxardım, qoydum stolun üstə ki, görüm, saatın şümarələri nə vaxt gəlib 3-ün üstündə*

*duracaqdır ki, börkümü götürüm, qaçım evə.* C.Məmmədquluzadə.

**ŞÜMƏRƏK** *sif.* Cavan, yenicə qalxmış. *Zeynalın, üzərində dayandığı bu cığır bitməz-tükənməz şümərək ağaclar arasında qaib olur.* Ə.Əbülhəsən.

**ŞÜMŞAD** *is.* [*fars.*] 1. Cürbəcür alətlər, ev əşyalari və s. hazırlanan çox möhkəm oduncaqlı həmişəyaşıl ağac.

2. Müqayisələrdə işlənir. *Könül mayil olub siyah telinə; Nazik barmağına, şümşad əlinə.* Aşıq Ələsgər. *Bir az müddət keçəndən sonra qız şümşad əlini yaxasına uzadıb saata baxıb və yerindən tez durub getdi.* N.Nərimanov. *Hamıdan irəlidə dayanmış nazik əndamlı, qarabirçək, şümşad qamətli gəlin Xəlilin salamını almağa macal tapmadı.* M.Hüseyn.

**ŞÜMUL** *is.* [*ər.*] *klas.* Şamil olma, dəxli olma, aid olma; aidiyyət. [Mollabaşı:] *Ona binaən mən cəmi xütəbaya hökm yazdım ki, tamam vilayətlərin mənabirində xalqa elan etsinlər ki, haman əhadisin silsileyi-səfəviyyəyə şümulu yoxdur.* M.F.Axundzadə.

**ŞÜMÜR** *is.* [*ər.* xüsusi addan – Şümr] Zalım, qaniçən, qatil, cəllad mənasında. *Düzü elə millətin əyri-üyrüsü üçün sənin kimi əli əsməyən bir şümür lazımdır! – deyə, Müqim bəy Cavanşir Mirzə Polad müəllimi gözlərinin qabağına gətirib hiddətlə söyləndi.* S.Rəhimov. [Həsənov:] *Şümürə, Yezidə gələn lənət mənim atama gəlsin, əgər mən* [Abbası] *kolxoza buraxsam.* M.İbrahimov.

**ŞÜRU** [*ər.*]: **şüru etmək (eləmək)** – başlamaq. *Sərdar Zaman xan sözə şüru elədi.* M.F.Axundzadə. *..Məşədi Əsgər gəmiçilik işinə mahir olduqda özü üçün bir barkaz alıb işləməyə şüru etdi.* S.M.Qənizadə. *Orada bir həftənin ərzində təzə bir otaq tikməyi bizə tapşırdı. Biz işə şüru etdik.* M.İbrahimov.

**ŞÜRUT** [*ər.* "şərt" söz. cəmi] Şərtlər (bəzən şərt-şürut şəklində işlənir). [Şeyx Əhməd:] *Keçər. Amma ortada bir neçə şərt var.* [Şeyx Nəsrulla:] *İki dost arasında nə şərt, nə şürut.* S.Rəhman. ☐ **Şürut bağlamaq (qoymaq)** – şərt (şərtnamə) bağlamaq. [Yusif şahın hökmranlığı dövründə Qolland tayfasından] *..bir elçi əməlƏsi ilə Qəzvinə varid oldu ki, İran dövləti ilə .. ticarət üçün şürut bağlasınlar. Elçinin əməlisi ilə Yusif şahın hüzuruna yetirdilər.* M.F.Axundzadə.

**ŞÜŞ** *is.* Nazik ağac, çubuq. *Lobya ləklərinə şüş basdırmaq.*

**ŞÜŞƏ** *is.* 1. Kvarslı qumu əridib kimyəvi üsulla işləmək nəticəsində alınan sərt, şəffaf material. *Şüşə istehsalı. Tutqun şüşə. Naxışlı şüşə. Şüşə zavodu.* ☐ **Şüşə kimi (tək)** – 1) öz parıltısı, şəffaflığı və s. cəhətdən şüşəyə oxşayan (təşbehlərdə işlənir). *Silinib çəkməsi, şüşətək parlaq; Daranmış saçları geriyə qıvraq.* H.K.Sanılı; 2) *məc.* Durğun, ölgün, hərəkətsiz, cansız. *Qaraşın sifəti iri, durğun, şüşə kimi soyuq gözləri vardı.* M.Hüseyn.

2. Bu materialdan hazırlanan nazik lay, təbəqə və ya başqa formalı şey, məmulat. *Stolüstü şüşə. Şüşə güldan. Lampa şüşəsi. Şüşə tıxac. Şüşə boru. – Kitab şkafının şüşələri tərtəmiz silinmişdi.* Mir Cəlal. *Qutu pəncərə şüşəsini para-para elədi.* S.Rəhman. // Şüşə qırığı, şüşə parçası. *Əlimi şüşə kəsib.* ☐ **Böyüdücü şüşə** – şeyi çox böyüdülmüş şəkildə göstərən linza, ədəsə. // Butulka. *Bir şüşə limonad. İki şüşə şərab. – Mirzə Səfər eşitmişdi ki, şeir yazmaq üçün iki vasitə lazımdır: xəlvət otaq və bir şüşə şərab.* Ə.Haqverdiyev. *Murad bəy və yoldaşları içki şüşələrindən bir neçəsini boşaltmış və oturmaqdan yorulub uzanmışdılar.* T.Ş.Simurq.

**ŞÜŞƏBƏND** b a x **aynabənd**. *..Sona xala şüşəbənd otaqda masaya süfrə salıb məni oraya təklif etdi.* S.S.Axundov. *Zeynal geniş bir şüşəbəndi keçib, yemək otağına girdi.* S.Hüseyn.

**ŞÜŞƏBƏNDLİ** b a x **aynabəndli**. *Qoca usta fikirli-fikirli, beş-altı pilləli daş pilləkənlə qalxıb şüşəbəndli balkona çıxdı.* M.Hüseyn. *İki tərəfinə yeni səliqə ilə balkonlu, eyvanlı, dik damlı, şüşəbəndli qəşəng evlər düzülmüş asfaltlı küçə gündüz kimi işıq idi.* M.Rzaquluzadə.

**ŞÜŞƏCİK** *is.* Kiçik şüşə alət. *Sınaq şüşəciyi. Mikroskop şüşəciyi.*

**ŞÜŞƏÇİ** *is.* 1. Şüşə sənayesi fəhləsi, şüşə istehsalı işçisi.

2. *xüs.* Ərgin şüşədən üfləmə yolu ilə müxtəlif qablar, fiqurlar və s. hazırlayan usta.

3. B a x **şüşəsalan**.

**ŞÜŞƏÇİLİK** *is.* Şüşəsalanın işi, sənəti, peşəsi.

**ŞÜŞƏKƏSƏN** *sif.* Şüşə kəsməyə məxsus. *Şüşəkəsən alət.* // İs. mənasında. *Şüşəkəsənlə şüşələri kəsmək.*

**ŞÜŞƏKİ** *is. məh.* Rişxənd, ələsalma, arayaqoyma; masqara, fitəbasma. ◻ **Şüşəkiyə basmaq (qoymaq)** *məh.* – lağa qoyub gülmək, istehza etmək, araya qoymaq, ələ salmaq, fitə basmaq. *..Əgər buraya bir qəribin yolu düşsə, onu şüşəkiyə basacaqlar.* C.Məmmədquluzadə.

**ŞÜŞƏLƏMƏ** "Şüşələmək"dən *f.is.*

**ŞÜŞƏLƏMƏK** *f.* Şüşə salmaq. *Pəncərələri şüşələmək.*

**ŞÜŞƏLƏNMƏ** "Şüşələnmək"dən *f.is.*

**ŞÜŞƏLƏNMƏK** *f.* Şüşə vurulmaq, şüşə salınmaq. *Otağın işıq mənbəyi bircə qapı və bir də damdakı şüşələnmiş* (f.sif.) *balaca pəncərəvari bir baca olduğundan otaq lazımi qədər işıq deyildi.* T.Ş.Simurq.

**ŞÜŞƏLƏŞDİRMƏ** "Şüşələşdirmək"dən *f.is.*

**ŞÜŞƏLƏŞDİRMƏK** *f.* Əridib şüşə halına salmaq, şüşə kimi etmək. *Qumu şüşələşdirmək.*

**ŞÜŞƏSALAN** *is.* Şüşə salmaqla məşğul olan adam; aynasalan, aynasaz, şüşəçi. [Məmməd Əliyev] *yaxşı dülgər, səliqəli şüşəsalan, mahir daşyonan idi.* Ə.Sadıq.

**ŞÜŞƏSİLƏN, ŞÜŞƏTƏMİZLƏYƏN** *sif.* Avtomobilin, nəqliyyat vasitələrinin nəzarət şüşəsini təmizləyən. *Açar horizontal vəziyyətdə saxlandıqda şüşətəmizləyən cihaz işləmir.* Ə.Əliyev. // *İs. mənasında.* Bu işi görən cihaz. *Maşının şüşətəmizləyəni işləmir.*

**ŞÜŞƏÜFÜRƏN** b a x **şüşəçi** 2-ci mənada.

**ŞÜŞƏVARİ** *sif.* Şüşəyəbənzər, şüşə kimi, şüşəyəoxşar. *Şüşəvari cisim. Şüşəvari material. – Lava Yer üzərində tez soyuması nəticəsində tərkibinin bir qismi kristallaşır, digər qismi isə xırda kristallik və yaxud şüşəvari olur.* M.Qaşqay. // Şüşə kimi şəffaf.

**ŞÜŞƏYƏBƏNZƏR, ŞÜŞƏYƏOXŞAR** b a x **şüşəvari**. *Şüşəyəbənzər cisim.*

**ŞÜŞTƏR** *is.* [*fars.*] *mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *Ələ aldı qavalı ol düxtər; Oxudu çəm-xəm ilə bir "Şüştər".* S.Ə.Şirvani. "*Rast*", "*Şur*", "*Segah*", "*Şüştər*", "*Çargah*", "*Bayatı-Şiraz*" *və* "*Humayun*" *Azərbaycan musiqisinin yeddi əsas ladıdır.* Ü.Hacıbəyov.

**ŞÜTÜLLƏMƏ** "Şütülləmək"dən *f.is.*

**ŞÜTÜLLƏMƏK** b a x **şütümək**. *Dağların başında bulud oynaşır; İlan kimi şütülləyir, dırmaşır.* A.Səhhət.

**ŞÜTÜMƏ** "Şütümək"dən *f.is.*

**ŞÜTÜMƏK** *f.* Bərk qaçmaq, sürətlə getmək, bərk sürüb getmək, ötüb keçmək. *..Balaca Sabir şütüyüb, o tərəf-bu tərəfə qaçırdı.* S.Rəhimov. *Beş dəqiqədən sonra maşın Araz çayına doğru şütüdü.* M.Hüseyn.

**ŞÜUR** *is.* [*ər.*] 1. Dərrakə, anlaq, düşünmə; dərk etmə, anlama qabiliyyəti. ◻ **Şüuru dolaşmaq** – sözünü, işini, hərəkətini bilməmək; ağlı çaşmaq. [Alagöz] *başını itirir, onun .. şüuru dolaşırdı.* S.Rəhimov. **Şüuruna çatmaq** – başa düşmək, anlamaq. *Bayram gah yasavullara, gah da kəndlilərə baxır və elə bil qocanın sözləri onun şüuruna çatmırdı.* M.Hüseyn. *Bu dəfə qızın sualı İlyasın şüuruna çatdı.* Ə.Məmmədxanlı. // Şüurluluq. *Şüurun inkişafı tərbiyənin ən əsas məqsədlərindən biridir.* **Şüurunu itirmək** – 1) bayılmaq, ağlını itirmək. *Xəstə qızdırmanın şiddətindən şüurunu itirdi.* – [Səmirə:] *Nə vaxt və necə şüurumu itirdiyim yadıma gəlir.* M.Hüseyn; 2) dəli olmaq, sərsəmləmək, ağlı başından çıxmaq.

2. Düşüncə, ağıl, fəhm. [Yaşlı kişi:] *Gənclik hissiyyatım məni ona tərəf çəksə də, şüurum belə bir işdən çəkinməyi mənə tövsiyə edirdi.* S.Hüseyn. // Qanacaq.

3. İctimai həyatın insan və ya bir qrup adam tərəfindən dərk edilməsi, başa düşülməsi, anlaşılması. *Siyasi şüurun artması. Vətəndaşlıq şüuru. – ..Bir yazıçının şüuruna başqasının fikrini yerləşdirmək xam xəyallardandır.* M.S.Ordubadi.

4. *fəls. psix.* İnsan beyninin gerçəkliyi əks etdirmə prosesi. *Şüur beynin funksiyasıdır. Materiyanın birinciliyi və şüurun ikinciliyi.* // Müəyyən ictimai sinifləri təmsil edən adamların psixologiyası, siyasi və fəlsəfi baxışları, dini, bədii və s. görüşləri. *Varlıq şüuru müəyyən edir. İctimai şüur. Dini şüurun formaları.*

**ŞÜURLANMA** "Şüurlanmaq"dan *f.is.*

**ŞÜURLANMAQ** *f.* Şüurlu olmaq, şüuru artmaq, daha şüurlu olmaq, ağıllanmaq.

**ŞÜURLU** *sif.* Şüuru olan, anlaqlı, dərrakəli, düşüncəli, fəhmli, qanacaqlı. *Şüurlu tələbə. Şüurlu uşaq*. – [Süleyman:] *Xeyr, bəy, Əsgər çox gözəl oğlandır, çox ağıllı, yaraşıqlı və çox da şüurlu oğlandır.* Ü.Hacıbəyov. // Şüurun inkişafı ilə, şüurla bağlı olan. *Şüurlu yaş. Şüurlu həyat. Şüurlu sevgi. Ömrünün şüurlu dövrü*. // Hər hansı bir görüşə, prinsipə istinad edən. *Şüurlu ateist. Şüurlu materialist*. // *Zərf mənasında.* Ağılla düşünərək, fikirləşərək. *İşə şüurlu yanaşmaq*. // Qəsdən, qərəzlə, bilə-bilə edilən. *Şüurlu hərəkət*.

**ŞÜURLULUQ** *is*. Şüurlu olma, dərrakəsi olma; fəhmlilik, düşüncəlilik, dərrakəlilik.

**ŞÜURSUZ** *sif.* 1. Şüuru olmayan; dərrakəsiz, fəhmsiz, düşüncəsiz, anlaqsız. *Şüursuz adam*. – [Səlimbəy:] *..Mənim qızım oynamaq bilsəydi, başına dolanardım. Amma nə etməli ki, atası kimi şüursuz* (z.) *çıxıb, ayaq atmağı da bilmir*. S.S.Axundov. // Ağılsız, ağla uymayan, ağla, şüura zidd, qanacaqsız. *Şüursuz hərəkət. Şüursuz iş.* // *zərf* Qeyri-şüuri, qeyriiradi. *Şüursuz təqlid etmək.*

2. Bayğın, bayılmış, özündən getmiş, şüurunu itirmiş. *Gözlərini* (z.) *şüursuz yummuş halda. – Xəstə gözlərini böyük-böyük açmış, ətrafı şüursuz nəzərlərlə seyr edirdi.* H.Nəzərli.

**ŞÜURSUZLUQ** *is.* 1. Dərrakəsizlik, fəhmsizlik, düşüncəsizlik, ağılsızlıq; qanacaqsızlıq. *Bu adamın hərəkətləri şüursuzluğundan irəli gəlir.*

2. Ağla, şüura uymayan hərəkət, düşüncəsiz; ağılsız iş. *Şüursuzluq etmək.*

**ŞÜVƏ** b a x **şəvə**. [Zalxa:] *Ətin tökülsün, a kişi! O uzun, şüvə saqqala hayfın gəlmədi?* S.Rəhman.

**ŞÜVƏRƏ: şüvərəyə vermək** *dan.* – öz hərəkəti ilə birini ağır, çıxılmaz, qorxulu vəziyyətə salmaq, ümidini puça çıxartmaq, aldatmaq, satmaq, ölümünə və yaxud bədbəxtliyinə səbəb olmaq.

**ŞÜVƏRƏN** *is. bot.* Çəmənlərdə bitən, sarıləçəkli, buynuzşəkilli meyvələri xalq təbabətində dərman kimi istifadə edilən ikiillik bitki. *Dəllək Usta Cəfər xəstənin başının üstünü kəsib qan aldı, Gülsüm xala da şüvərən bişirdi, gətirdi..* C.Məmmədquluzadə.

**ŞÜVÜL** *is.* Uzun, düz ağac. *Bir gənc əlinə uzun, şüvül bir ağac – müvazinət ağacı* (*ləngər*) *alaraq, kəndirin üstündə rəqs edərdi.* H.Sarabski.

**ŞÜY** *is.* Cavan, nazik budaq, zoğ.

**ŞÜYÜD** *is. bot.* Çətirlilər fəsiləsindən yeməli, ətirli bostan bitkisi. *Tərkibində vitamin olan keşniş, şüyüd, tərxun kimi göyərtiləri, xörək bişirib hazırladıqdan sonra tökmək lazımdır.* C.Nuriyev.

**ŞÜYÜDPLOV** *is.* Düyüyə şüyüd qatılaraq bişirilən plov növü.

**ŞVELLER** *is.* [*alm.*] P şəkilli yayma palaz tir.

**ŞVERTBOT** *is.* [*alm.*] Birdorlu, yelkənli yüngül idman gəmisi.

# Tt

**T** Azərbaycan əlifbasının iyirmi yeddinci hərfi. B a x **te**.

**TA** *əd.* 1. Bir şeyin başlandığı nöqtəni bildirir; lap (ondan sonrakı isim çıxışlıq halda olur). *..Dənizin ta göbəyindən qopub gələn dalğalar .. gəmini bir top kimi atıb-tuturdu.* A.Şaiq. [Tahir] *bəlkə də sərnişinlərin hamısından əvvəl pəncərəyə yanaşıb, ta uzaqlardan şəhərə baxırdı.* M.Hüseyn. *İnad və qətiyyət ta uşaqlıqdan* [Ərəblinskinin] *qəlbinə hakim olmuşdu.* S.Rəhman.

2. Bir işin həddini, qurtaracağını, sonunu bildirir (ondan sonrakı isim yönlük halda olur). *Onu ta saat üçə qədər gözlədik. Küçənin ta axırına qədər yüyürdüm.* – [Məlik Məmməd] *ta sübhə kimi barmağının ağrısından yata bilmədi.* Çəmənzəminli. *Məktəbin gen, hündür qapısından ta darvazaya qədər olan bir-iki yüz addımlıq ensiz xiyaban bir az kölgəlikdi*. Ə.Əbülhəsən. *Qayanın altındakı uçurumdan çınqıl süzərək ta dərəyə qədər gedirdi.* B.Bayramov.

3. Məqsəd bildirir – ta ki, madam ki. *Bahadır istədi ki, gizlənsin, ta qız onu görməyə.* N.Nərimanov. ☐ **Ta ki** – b a x **ta** (3-cü mənada). *Ta ki mənzurun olubdur, Qövsi, ol qamət sənin; Yey gəlir min sərvdən bir misrəi-mövzun sənə.* Q.Təbrizi.

4. Daha, bir də, artıq, bundan belə. [Niyazalı:] *Məni öldürmə, ta heç kəsnən işim olmaz*. "Qaçaq Nəbi". // Daha. [Məşədi Ağakişi:] *A balam, getmirsən getmə, ta yalan niyə deyirsən?* C.Məmmədquluzadə. [Hacı Mehdi:] *İndi ta mən bir zad bilmirəm*. Ə.Haqverdiyev.

**TAAM** *is.* [*ər.*] 1. Xörək, yemək, bişmiş. *Taam bişirmək.* – [Pişxidmətbaşı:] *Tapşırmışam, aşpazlar şam üçün taam hazır etməyə məşğuldurlar.* M.F.Axundzadə.

2. Yemək, yemə, yemək işi. *İnsafımın və vicdanımın yanında məsul olaram, əgər yalan desəm ki, təqribən yarım saat mənim taamım çəkdi.* C.Məmmədquluzadə. *Taamdan sonra Qızxanım süfrəni yığışdıraraq dedi.* S.S.Axundov. ☐ **Taam etmək** – xörək yemək.

**TAARÜF** *is.* [*ər.*] Bir-birini tanıma, bir-biri ilə tanış olma, bir-birini tanıma.

**TAB** *is.* [*fars.*] Güc, qüvvət, taqət. *Əlinin tabı yoxdur. – Yatmaq üçün gözlərimin xabı var; Dərd çəkməyə mən yazığın tabı var.* "Qurbani". ☐ **Tab (tabı) qalmamaq** – gücdən düşmək, taqətdən düşmək, üzülmək. *Artıq qollarımda qalmamışdı tab; Üzmüşdü canımı çəkdiyim əzab.* Ə.Cavad. **Tab etmək (gətirmək)** – dözmək, davam gətirmək. [Abbas:] *Könül necə tab eyləsin; Mən səndən ayrılım, gedim?* "Abbas və Gülgəz". *Əridir mum kimi daşı fəraqın, ey gül; Mən necə atəşi-hicranına bəs tab eləyim?* S.Ə.Şirvani. **Tab gətirməmək (gətirə bilməmək)** – 1) özünü saxlaya bilməmək, dayana bilməmək, dözməmək. *Əvvəl kağız yazdım və sonra tab gətirmədim, bir teleqraf da vurdum.* C.Məmmədquluzadə. *Arvadlar tab gətirə bilməyib ağladılar, kişilər başlarını yerə dikdilər..* N.Nərimanov. *Çoban onu bir az da sualcavaba tutsaydı, Gözəl tab gətirməyib yenə ağlayacaqdı.* M.Hüseyn; 2) duruş gətirə bilməmək, davam gətirə bilməmək. *Düşmən tab gətirə bilməyib qaçır.* "Qaçaq Nəbi". **Tab tutmamaq (tuta bilməmək)** – b a x **tab gətirməmək (gətirə bilməmək)**. [Ağa Kərim xan:] *Ürəyim tab tutmayır, minbaşı, məni qınama, qınama!..* N.Vəzirov. *Bir azdan Gülöyşə ilə Xanım yerlərində tab tuta bilməyib, küçə tərəfə gəldilər*. S.Rəhimov. **Tabdan düşmək** – taqətdən düşmək, gücdən düşmək, haldan düşmək, üzülmək. *Hüseyni o qədər vurdular ki, tabdan düşdü*. S.Rəhman. [Odunçuoğlu] *tabdan düşmüş halda güclə ayaqlarını sürüyərək xan malikanəsindən uzaqlaşmağa başladı.* Ə.Məmmədxanlı. **Tabı gəlməmək** – gücü olmamaq, gücü çatmamaq, bacarmamaq. *..Vahid adi bir tələbə idi, Gəldiyev ilə tutaşmağa tabı gəlməzdi*. Mir Cəlal. **Tabı kəsilmək** – b a x **tabdan düşmək**. *Hicrində gecələr kəsilib tabım; Günbəgündən artar cövrü əzabım*. Q.Zakir.

**TABAQ** *is.* Düyü, buğda və s. hövsərləmək, yaxud şey qoymaq və ya başqa məqsədlər üçün enli taxtadan oyulmuş ağacdan hazırlanan dayaz, girdə, ya uzunsov qab. *Böyük tabaqlara buğda töküb isladardılar*. H.Sarabski. [Fatma arvad] *obaşdandan qalxıb çirmənmiş,*

*tabağı qabağına qoyub, pud yarım buğda unundan xəmir yoğurmuşdu.* Mir Cəlal. // Təknə. *Bəzən Mələk bacı işdən qayıdarkən eyvanda stolun üstündə dəyirmandan yenicə gətirilmiş bir tabaq un, təzə bişirilmiş çörək və ya bir dolça süd görərdi.* Ə.Sadıq.

**TABAQÇA** *is.* Kiçik tabaq, balaca tabaq. *Tabaqçada xəmir yoğurmaq.*

**TABAQÇALANMA** "Tabaqçalanmaq"dan *f.is.*

**TABAQÇALANMAQ** bax **tabaqlanmaq**. *Qızılgül axçalandı; Gülü tabaqçalandı; Can verəndə gəlmədin; Qəbrim də mıxçalandı.* (Bayatı).

**TABAQÇI** *is. köhn.* 1. Tabaqda şey gəzdirib satan adam. *Naməlum şəxs tez-tez saatına baxır, tabaqçı müsəlmandan şeylərini götürüb oradan başqa yerə getməsini tələb edirdi.* M.S.Ordubadi.

2. Tabaq qayıran usta.

**TABAQLANMA** "Tabaqlanmaq"dan *f.is.*

**TABAQLANMAQ** *f.* Tabaq kimi enli – yastı olmaq; açmaq. *Vaxt yetişib vədə çatanda, qızılgül kolları da düymələnib qönçələnir, sonra tabaqlanıb açır, bağçanın təmtərağını artırırdı.* S.Rəhimov. *Baharın elə vaxtı idi ki, adam iki göz də satın alıb, açılan çiçəyə, tabaqlanan* (f.sif.) *güllərə baxmaq istəyirdi..* B.Bayramov.

**TABAN** *is.* [*fars.*] *köhn.* Parlaq, parıldayan, işıqlı.

**TABASARANLAR** *cəm* Dağıstanın Tabasaran və Xiv rayonlarında yaşayan, iber-Qafqaz dillərinin ləzgi qrupuna daxil olan bir dildə danışan kiçik xalq və bu xalqa mənsub adamlar.

**TABAŞİR** *is.* [*fars.*] Kimya, rezin və s. sənaye sahələrində işlədilən yumşaq ağ əhəngdaşı. // Həmin əhəngdaşının yazmaq, bir şeyi ağartmaq və s. üçün işlədilən parçası, tozu və ya məhlulu. *Divarı tabaşirlə ağartmaq. – Semyonov lövhədə tabaşirin saat mexanizmi kimi ahəngdar şəkildə taqqıldamasından dərsin necə keçdiyini müəyyənləşdirərdi.* İ.Şıxlı.

◊ **Tabaşir dövrü** *geol.* – mezozoy erasının üçüncü geoloji dövrü.

**TABAŞİRLİ** *sif.* 1. Tabaşir tozu qonmuş, tabaşirə bulanmış. *Əlləri bütün tabaşirlidir.*

2. Tərkibində tabaşir olan. *Tabaşirli məhlul.* ◻ **Tabaşirli kağız** – üzərinə ağ yapışqan rəngi çəkilmiş kağız.

**TABE** *is.* [*ər.*] Başqasının tabeliyində, hökm və iradəsi altında olan, ondan asılı olan, onsuz heç bir şey edə bilməyən, tabe olan. // *sif.* Tabe olan, asılı olan, tabeliyə əsaslanan. *Tabe dövlətlər.* // *İs. mənasında.* Xidmət üzrə özündən böyüyə tabe olan vəzifəli şəxs. *Müdirin öz tabeləri ilə rəftarı gözəldir.* ◻ **Tabe etmək** – asılı etmək, itaəti altına almaq, öz iradəsinə uyğun olaraq hərəkət etməyə məcbur etmək, ram etmək. [Səməd bəy] *hamını öz fikrinə, öz arzusuna tabe etmək istərdi.* Çəmənzəminli. [Elçin:] *..Başsız axan suları özümüzə tabe etsək də, hələlik göylərə gücümüz çatmır.* Z.Xəlil. **Tabe olmaq** – birinin və ya bir şeyin hökmü altına düşmək, onun iradəsi ilə hərəkət etməyə məcbur olmaq, razı olmaq, itaət etmək, boyun əymək. [Gəray:] *Beləliklə, o tabe olsa bizə; Şübhəsiz, baş əyər hər əmrimizə..* A.Şaiq.

**TABEİYYƏT** [*ər.*] *köhn.* bax **tabelik**. [Şah:] *Mirzə Təqi xan, mən də istəmirəm, mənim tabeiyyətimdə olan məmləkətdə zülm olsun.* C.Cabbarlı.

**TÁBEL** [*alm.* Tabella] 1. Cədvəl.

2. Fəhlə və qulluqçuların işə gəlib-getmələrini qeydə almaq üçün jetonlu lövhə (habelə jetonun özü) və ya dəftər. *Tabelə qol çəkmək.*

**TABELÇİ** *is.* İdarə və müəssisələrdə işçilərin işə gəlib-getmələrinin tabel üzrə uçotunu aparan işçi.

**TABELİ** *sif.*: **tabeli mürəkkəb cümlə** *qram.* – budaq cümləsi baş cümləyə tabe olan mürəkkəb cümlə; məs.: *Yasəmən Qaraca qızı səslədi ki, gəlib onun başına su töksün.* S.S.Axundov.

**TABELİK** *is.* Tabe olma, asılılıq, tabeiyyət. ◻ **Tabelik göstərmək** – tabe olmaq. **Tabeliyində olmaq** – birindən asılı vəziyyətdə olmaq, sərbəst olmamaq. **Tabeliyində saxlamaq** – özündən asılı vəziyyətdə saxlamaq, sərbəstlik verməmək. *Əri Həmzədən başqa hamını, öz tabeliyində saxlamaq istəyib, buna da müvəffəq olan Əminənin gərək indi də əmri yerinə yetə idi.* Ə.Əbülhəsən.

**TABESİZ** *sif.:* **tabesiz mürəkkəb cümlə** *qram.* – iki və daha artıq müstəqil cümlədən düzələn mürəkkəb cümlə; məs.: *Hava tutqunlaşır, ətraf dumanlı bir pərdəyə bürünürdü.* M.Hüseyn.

**TABLAMA** "Tablamaq"dan *f.is.*

**TABLAMAQ** b a x **tablaşmaq**. *Bu dərdə tablamaq müşkül olsa da; Eşqsiz ürəyi daş sanıram mən.* B.Vahabzadə. – *De, niyə qaçaqsan aran yerindən? – Doğrusu, istiyə tablamıram mən.* H.Hüseynzadə.

**TABLAŞMA** "Tablaşmaq"dan *f.is.*

**TABLAŞMAQ** *f.* Tab gətirmək, davam gətirmək, dözmək, tablamaq. [Bayram:] [Pərzadın] *ölümünə heç vaxt razı ola bilmərəm və Tarverdiyə də arvad olmağına tablaşmanam!* M.F.Axundzadə. [Rüstəm:] *Bir az tablaş, səni dəmirçigilə köçürəcəyəm.* S.Rəhimov.

**TABLI** *sif.* Dözümlü, dayanıqlı, davam gətirən, davamlı. *Məni belə tablı edən; Ancaq onun öz əlidir.* M.Rahim.

**TABLÓ** [*fr.* tableau] 1. *rəss.* Şəkil, rəsm, iri şəkil. *Güldanın üzərində Bağdad həyatının cürbəcür tabloları var idi.* M.S.Ordubadi. *Səttar Bəhlulzadənin ilk yaradıcılıq sərgisində 180-dən yuxarı tablo və etüd toplanmışdır.* (Qəzetlərdən).

2. *xüs.* Nəzarət altında olan obyektlərin vəziyyətini göstərmək üçün üzərində işıq və ya elektromaqnit göstəricilər olan siqnal (işarə) lövhəsi.

**TÁBOR** *is.* 1. Bir yerdən başqa yerə köçən qaraçı dəstəsi, habelə onların düşərgəsi, at-arabası. *Dağların ətəyində yerləşən üzüm bağlarının kənarında köçəri qaraçı taboru dincəlir.*

2. Qədimdə: istehkam halına gətirilmiş kazak düşərgəsi (at-arabaları ilə bir yerdə).

3. *köhn. hərb.* Batalyon. *Tabor komandiri.* – *Alay üç tabordur.* H.Nəzərli. *Mirbalayev tabora "azad" komandası verdi.* M.Hüseyn.

**TABSIZ** *sif.* Gücsüz, taqətsiz, qüvvətsiz.

**TABSIZLAŞMA** "Tabsızlaşmaq"dan *f.is.*

**TABSIZLAŞMAQ** *f.* Tabdan düşmək, taqətsiz olmaq, gücdən düşmək.

**TAB(Ü)-TAQƏT, TAB(Ü)-TAVAN** *is.* [*fars.*] Güc, qüvvət, taqət, tavan. [Zəhra:] *Qalmamış məndə zərrə tabü-tavan; Məni qəhr et də, lakin atma, aman!..* H.Cavid. [Gülçöhrə:] *Yox, mən bu hala davam edə bilmərəm. Daha məndə tabü-taqət yoxdur.* Ü.Hacıbəyov.

**TABÚ** [*Polineziya dilindən*] 1. İbtidai xalqlarda: əfsanəvi etiqadlara, mövhumi təsəvvür və zehniyyətlərə görə işlənməsi (dilə gətirilməsi) mütləq bədbəxtliyə səbəb olacaq və buna görə də söylənməsi qadağan olunmuş söz.

2. Müasir dildə: senzura tərəfindən işlənməsi qadağan edilmiş söz, yaxud qaba, ədəbsiz sayıldığına görə işlənməsi qeyri-münasib hesab edilən söz.

**TABURET(KA)** [*rus.*] b a x **kətil** 1-ci mənada. *Tahir böyründəki taburetdə* [Lətifəyə] *yer göstərdi.* M.Hüseyn. *Gülzar .. qayıdıb, yaş taburetkaları divar dibindən çəkdi.* İ.Hüseynov.

**TABUT** *is.* [*ər.*] Cənazəni qoymaq üçün iri qutu. *Mehralı bəyin tabutunu xanlıq imarətinin bağına qoymuşdular.* Çəmənzəminli. *Zəfər bayraqlarını başı üstündə tutun; O şəfəqli, o nurlu, o işıqlı tabutun.* Ə.Cəmil.

**TAC** *is.* [*fars.*] 1. Hökmdarlıq rəmzi olaraq padşahların başlarına qoyduqları qızıl və cavahiratla bəzənmiş papaq. *Padşah bunların ağıl-dərrakəsin görüb, yavaşca durdu ayağa, tacı götürüb qoydu oğlanın başına.* (Nağıl). [Vaqif:] *Nifrət! Qan çanağı taclara nifrət; Var olsun azadlıq, bir də məhəbbət!* S.Vurğun.

2. *məc.* Padşah hakimiyyəti. *Tacdan əl çəkmək. İmperiya dağılır, taclar düşür.*

3. *məc.* Taca oxşayan, tacı xatırladan şey. // Bəzi quşların başında daraq şəklində çələng. // Zinət üçün başa qoyulan çələng və s. [Qəmər:] *Bunlardan tac hörüb sənin başına qoyacağam.* S.S.Axundov. [Sevər:] *Qızları da göndərərəm ki, çöldən sənin üçün tac qayırmaqdan ötrü çiçək dərsinlər.* C.Cabbarlı.

4. *məc.* Son zirvə, ən yüksək zirvə; ən sevimli, ən qiymətli adam, şey haqqında. *Sən mənim həyatım, ömrüm, tacımsan.* M.Rahim. *Eşq sözü sözlərin sultanıdır, tacıdır; Eşq həyat ağacıdır.* B.Vahabzadə.

5. *astr.* Günəşin, Ayın və ya parlaq ulduzların ətrafında görünən parlaq işıq dairəsi; halə. *Tam Günəş tutulma zamanı xromosferin parlaq gümüşü rəngli geniş təbəqə ilə əhatə*

*olunduğunu görürük. Buna Günəş tacı deyilir*. R.Hüseynov.

6. *bot.* b a x **taccıq**.

◊ **Başına tac qoymaq** *məc.* – yaxşı işə, münasibətə qarşı yaxşılıq etmək.

**TACBITRAQ** *is. bot.* Kolluq sahələrdə və meşənin açıq yerlərində bitən çoxillik ot bitkisi.

**TACCIQ** *is. bot.* Gülün, ayrı və ya bitişik ləçəklərdən ibarət hissəsi; tac.

**TACDAR** *is.* [*fars.*] Padşah, hökmdar (adətən şahlara, padşahlara təntənəli müraciət zamanı işlədilən epitet). *Dedi Xubçöhr: – Ey şəhi-tacdar; Hüzurunda olsam gərək bəxtiyar!* M.Ə.Sabir. [Vəzir:] *Çox sağ ol, şövkətli, şanlı tacdar!* A.Şaiq.

**TACİK** *is.* Tacikistanın əsas əhalisini təşkil edən irandilli xalq və bu xalqa mənsub adam.

**TACİKCƏ** *sif.* və *zərf* Tacik dilində. *Tacikcə kitab. Tacikcə öyrənmək.*

**TACİR** *is.* [*ər.*] Ticarətxanası olan; xüsusi ticarətlə məşğul olan adam. [Yaşlı kişi:] *Hacı Ramazan adlı bir tacirin ticarətxanasında ayda otuz manat maaşla qulluq edirdim.* S.Hüseyn. [Sultan bəy:] *Səni bir tacir oğlana verirəm ki, həmi cavan, həmi pullu, həmi mallı...* Ü.Hacıbəyov.

**TACİRLİK** *is.* Xüsusi ticarətlə məşğul olma. *Qasım bəydə tacirlik damarı daha qüvvətli idi*. A.Şaiq. [Əsgər:] *..Mən Hacı Mürsəl oğlu Əsgərəm, sənətim də tacirlikdir*. Ü.Hacıbəyov.

**TAC-TAXT** b a x **taxt-tac**. [Qızıl Arslanı] *Həmədana çağırıb hörmət göstərmək və əlahəzrətin tac-taxtına sədaqət göstərməsi üçün təminat almaq lazımdır.* M.S.Ordubadi.

**TAFTA** *is.* [*fars.*] Sıx toxunmuş ipək və ya pambıq parça. [Tarverdi:] *A gədə, nə böyük sandıqlardır! Yəqin içindəki tamam taftadır.* M.F.Axundzadə. // Həmin parçadan tikilmiş. [Tarverdi:] *Pərzad elə yaşı olduqca tafta tuman-köynək geysin.* M.F.Axundzadə. [Sara xanımın] *tafta köynəyi, zərxara arxalığı, nəyi, nəyi .. yox idi.* Qantəmir.

**TAĞ[1]** *is.* Qovun, qarpız, xiyar, pomidor və s. bostan bitkilərinin yerlə sürünən kolu. *Pomidor tağı. – Onu Taşauzda gördüm, kefi saz; Ətirli tağlardan qovun dərərkən.* S.Rüstəm.

**TAĞ[2]** *is.* [*farscadan*] Bəzi binaların yarımdairə şəklində olan damı; qübbə, günbəz. *Hədsiz səslər bir-birinə qarışıb – hamamın tağlarına düşmüşdü..* Çəmənzəminli. *Nəriman kənarda dayanıb, binanın tağına baxmaq fikrində idi.* Mir Cəlal. // Körpünün iki dayağını birləşdirən qövsşəkilli hörgü. // Böyük qapıların adətən qövs şəklində olan üst hissəsi. *Qəmərin nallarından qopan səs qala qapısının tağına düşüb cingildədi.* Çəmənzəminli. // *Sif. mənasında*. Tavanı bu şəkildə olan; tağlı. *İçərişəhərdə, yuxarı bazarda, Qoşa karvansaranın altında tağ bir zirzəmi vardı.* H.Sarabski.

**TAĞ[3]** *is.* Saçın iki yerə ayrılan yeri; həmin hissələrdən hər biri. *Əlilə tağını düzəldən zaman; Yaxından duyuldu ayaq səsləri.* M.Müşfiq. □ **Tağ ayırmaq** – saçı iki hissəyə ayırmaq.

**TAĞALAQ[1]** *is.* Sap, iplik və s. sarınan çarx. *..Arvad ayağa qalxdı və nə isə çaşqınlıqla cəhrənin ora-burasını, tağalağını, iyini, dəstəsini yoxladı.* Ə.Əbülhəsən. [Tapdıq] *özünü divarın dibinə verib, tağalağı dığırlatdı.* Ə.Vəliyev.

**TAĞALAQ[2]** b a x **taqqanaq**. *..Uşağın əlindəki tağalaq çörəklərin hərdən biri düşürdü yerə, arvad qaldırıb, tozunu silib verirdi uşağa.* C.Məmmədquluzadə.

**TAĞAR** *is. məh.* 83,2 kiloqram ağırlığında çəki vahidi. *Beş tağar arpa*. – [Həmzə:] *Məsələ bir-iki desyatin yerdə, bir-iki tağar buğdada, ya da beş-on baş qaramalda deyil.* Ə.Əbülhəsən.

**TAĞBƏND** *sif.* [*fars.*] *arxit*. Tağ şəklində olan; yarımdairəvi. *Tağbənd körpü. – ...Uşaq bu saat hücrənin qoşa tağbənd pəncərələri arxasında göz üzündən ötüb keçən sərsəri buludların içəridəki işığı tez-tez dəyişdirdiyinin fərqinə varacaq halda deyildi.* Ə.Məmmədxanlı.

**TAĞLI** *sif.* 1. Tağı, tağları olan. *Tağlı bina*.

2. Hörgüsü tağ şəklində olan. *Tağlı pəncərə* (*qapı*). – *Mədəniyyət evinin tağlı, naxışlı qapılarını* [Qızyetər Yarməmmədə] *göstərdi.* M.İbrahimov. *Taxtadan tikilmiş iki otaqlı; Döşəməsi torpaq, tavanı tağlı.* B.Vahabzadə.

**TAHİR** *is.* [*ər.*] *köhn.* Təmiz, pak.

**TAXÇA** *is.* [*fars.*] Şey qoymaq üçün divarda açılan oyuq. *Taxçalara düzülübdü bir neçə samovar, sandıqça .. və xırdavat şeylərdən.* C.Məmmədquluzadə. *Mətbəxin divarlarında xırda taxçalar olardı.* H.Sarabski.

**TAXEÓMETR** *is.* [*yun.*] Üfüqi və yer ölçmə işlərində işlədilən şaquli bucaqları ölçmək üçün geodeziya aləti.

**TAXEOMETRÍYA** *is.* [*yun.*] Yerin qabarıqlı planını düzəltmək üçün uzaqdan topoqrafik şəkilalma üsulu.

**TAXIL** *top.* Dənindən un və ya yarma hazırlanan bitkilərin (arpa, buğda, çovdar və s.) ümumi adı. *Taxıl bitkiləri. Taxıl əkmək.* – *Taxıllar boy atmış və sünbül bağlamağa başlamışdı.* Ə.Sadıq. // Həmin bitkilərin dəni. *2 ton taxıl.* – [Şərəfoğlu Rüstəmə:] *Keçən il hər hektardan neçə sentner pambıq, neçə sentner taxıl götürmüşsünüz?* M.İbrahimov.

**TAXILBİÇƏN** *is.* Taxıl biçmək üçün maşın, alət. *Yeni markalı taxılbiçən.* // Biçinçi. // Sif. mənasında. *İndi sovxoz tarlalarında yük avtomobilləri görünür, traktor və taxılbiçən maşınlar işləyir.* Ə.Vəliyev.

**TAXILBİTİ** *zool.* b a x **buğdabiti**.

**TAXILÇİÇƏKLİLƏR** *cəm bot.* Taxılların və bəzi başqa bitkilərin daxil olduğu bitki fəsiləsi.

**TAXILÇI** *is.* Taxılçılıqla, taxıl əkib-becərməklə məşğul olan adam. *Taxılçının qarşısında isə çörək bolluğu yaratmaq vəzifəsi durmuşdu.* S.Rəhimov.

**TAXILÇILIQ** *is.* Kənd təsərrüfatının taxıl əkib-becərməklə məşğul olan sahəsi.

**TAXILDÖYƏN** *is.* Biçilmiş taxılı döyüb dəni samandan ayıran maşın. // Sif. mənasında. *Taxıldöyən maşın, vəl azlıq eləyirdi.* Ə.Əbülhəsən.

**TAXILQURDU** *is. zool.* Taxıla ziyan verən cücü.

**TAXILQURUDAN** *is.* Taxılı qurutmaq üçün maşın. // Sif. mənasında. *Taxılqurudan maşın.*

**TAXILMA** "Taxılmaq"dan *f.is.*

**TAXILMAQ** "Taxmaq"dan *məch.*

**TAXILSƏPƏN** *is.* Toxum səpmək üçün maşın. // Sif. mənasında. *Taxılsəpən maşın.*

**TAXILSOVURAN** *is.* Taxılın dənini samandan ayıran maşın. // Sif. mənasında. *Xırmanın bir tərəfində qoyulan taxılsovuran maşınların da gurultusu eşidilirdi.* Ə.Əbülhəsən.

**TAXILTƏMİZLƏYƏN** *is.* Taxılın dənini zibildən, xırda daşlardan və s.-dən təmizləmək üçün maşın. *Taxıltəmizləyəni işə salmaq.* // Sif. mənasında. *Qoca taxıltəmizləyən maşına baxır..*

**TAXİKARDİYA** *is.* [*yun.*] Ürək yığılmalarının tezləşməsi, ürək döyüntüsü.

**TAXMA** "Taxmaq"dan *f.is.*

**TAXMAQ** *f.* 1. İki şeyin uclarını bir-birinə keçirmək, ilişdirmək, yaxud bir şeyi başqa bir şeyə keçirmək. *Kişi müştüyə taxmaq istədiyi papirosa sığal verirdi.* Mir Cəlal. [Bəyim xala] *..bağırsaq kimi çözələnən rezin borunun bir ucunu su kranına taxıb asfaltı yuyurdu.* İ.Hüseynov. // Sancmaq, ilişdirmək, keçirmək. *Mən bir yolçu olub yoldan keçərkən; Qoparıb köksümə taxardım səni.* H.Cavid. *Taxır sinəsinə güldən, çiçəkdən; Açır süfrəsini bulaq başında.* S.Vurğun.

2. Keçirmək. *Qolbaq taxmaq. Barmağına üzük taxmaq.* – [Suğra] *güllü-çiçəkli krepdeşindən lap yeni dəblə tikilmiş uzun bir don, lak tufli geymiş, hətta sırğa da taxmışdı.* M.Hüseyn.

3. Bir şeyi bir şeyin üstünə qoymaq, bənd etmək, ilişdirmək. *Tahir sümük çərçivəli eynək taxmış ucaboy, buğdayısifət, qıvrımsaç alimi yaxşı xatırlayırdı.* M.Hüseyn. *Bəzən Lətif işini qurtarıb qəlibçilər şöbəsinə gəlir, gözlük taxmış gənc metaləridənlərə .. sataşırdı.* H.Seyidbəyli.

4. *dan.* Əyninə, əlinə keçirmək, geymək. *Nəriman, sevinmiş kimi əlcəyi barmaqlarına taxdı.* Mir Cəlal. [Çimnaz] *...pambıqlı canlığını əyninə taxıb, qızına da .. paltarını dəyişməyi təklif elədi.* Ə.Əbülhəsən.

**TAXT** *is.* [*fars.*] 1. Söykənəcəyi olmayan enli divan. *Mayaya elə gəldi ki, əldən düşmüş, taxtın üstündə nimdaş və yamaqlı yorğan-döşəkdə uzanan bu xəstə öz doğma bacısı, öz doğma anasıdır.* M.İbrahimov. *Sərvinaz sandıqçanı taxtın altından çıxartdı.* B.Bayramov.

2. Padşahların, hökmdarların rəsmi qəbul və təntənəli mərasimlər zamanı oturduqları zəngin bəzədilmiş kürsü. □ **Taxta oturmaq (çıxmaq)** – padşahlığa, hakimiyyətə başlamaq.

**Taxtdan salmaq** – padşahı hakimiyyətdən məhrum etmək, devirmək.

**TAXTA** *is.* [*fars.*] 1. Şalbandan mişarla kəsilmiş çox qalın olmayan yastı ağac parçası. *Ağacdan taxta kəsmək. – Zalın baş tərəfində sadəcə şam taxtalarından qayrılmış hündür, enli bir bufet vardı.* M.Hüseyn. [Direktor] *addımını atdıqca döşəmənin taxtaları cırıldayırdı.* B.Bayramov. // Taxtadan qayrılmış, taxtadan olan. [Bürcəliyev:] *Hamısı biclikdir, – deyə, taxta çarpayıdan ayağa qalxdı.* S.Rəhimov. *Qabaqda İmran kişi, onun ardınca Tahir taxta pilləkənlə ikinci mərtəbəyə qalxıb, balkonla sola doğru getdilər.* M.Hüseyn.

2. Taxtadan qayrılmış qapı, pəncərə və s. tayı, layı. *Xasay lampanı söndürdü, pəncərənin o biri taxtasını da atdı.* M.Hüseyn.

3. Hər hansı bir məqsəd üçün taxtadan hazırlanmış lövhəcik və s. *Çertyoj taxtası. Şahmat taxtası. Yazı taxtası.*

4. Parça (qumaş) zolağı. *Üç taxtadan tikilmiş yorğanüzü. – Göyərçin üstdən on iki taxta, ayağı yaşıl lentli tuman geymişdi.* S.Rəhimov. [Nənə:] *Bir gör nə deyirəm, ay qız, neçə taxtadan bir tuman çıxardı.* Mir Cəlal. // Torpaq zolağı. *Bu taxtada darı əkiləcək.*

◊ **Taxta kimi** – çox arıq, bir sümük, bir dəri. *Əlləzoğlu taxta kimi quru ovcunu qorun üstünə basıb cəld yerə atıldı.* İ.Hüseynov.

**TAXTABƏND** *is.* [*fars.*] Hər hansı məqsəd üçün taxtadan düzəldilmiş qurğu, yaxud taxtadan döşəmə vurulmuş yer. *Tut ağacının altında taxtabənddə oturmaq.*

**TAXTABİTİ** *is. zool.* Qansorucu kiçik tüfeyli cücü. *Taxtabiti dərmanı.*

**TAXTAÇƏKƏN** b a x **taxtakəsən**.

**TAXTAKƏSƏN** *is.* Şalbanlardan taxta kəsən maşın; taxtaçəkən. // Sif. mənasında. [Qonaqlar] *taxtakəsən, dəmiryonan dəzgahların .. komandirlərini danışdırıb sevinir, qibtə edirdilər.* Mir Cəlal.

**TAXTALAMA** "Taxtalamaq"dan *f.is.*

**TAXTALAMAQ** *f.* Taxta vurmaq, taxta düzmək. *Evin damını taxtalamaq.*

**TAXTALANMA** "Taxtalanmaq"dan *f.is.*

**TAXTALANMAQ** *məch.* Taxta vurulmaq, taxta düzülmək.

**TAXTALATMA** "Taxtalatmaq"dan *f.is.*

**TAXTALATMAQ** *icb.* Taxta vurdurmaq, taxta düzdürmək. *Mətbəxin damını taxtalatmaq.*

**TAXTALIQ** 1. *sif.* Taxta kəsmək üçün yarayan. *Taxtalıq şalban.*

2. *is.* Rəqəmlərdən sonra gələrək şeyin neçə taxtadan (4-cü mənada) tikildiyini göstərir. *On taxtalıq tuman.*

**TAXTA-PARA** *top.* Taxta parçaları, yararsız taxta qırıqları, tikə-para taxtalar.

**TAXTAPUŞ** *is.* [*fars.*] Şifer və s. vurmaq üçün evin və b. tikilinin damında taxtadan qurulan çardaq. // Üstü şifer, dəmir və s. ilə örtülmüş dam. *Narın çiskin sıxlaşmış dumanın arasından ələnir, taxtapuşların qırmızı borularından sızqa-sızqa süzülürdü.* S.Rəhimov. *Evin hündür taxtapuşu əvvəlki kimi öz heybətli görünüşü ilə irəlidə qaralırdı.* Q.İlkin. // Həmin çardaqla dam arasındakı yer. *Taxtapuşa kartof tökmək.*

**TAXTAPUŞÇU** *is.* Taxtapuş ustası olan dülgər.

**TAXTAPUŞLU** *sif.* Taxtapuşu olan, damında taxtapuş düzəldilmiş. *Birdən* [Tapdığın] *nəzəri kəndin qırağındakı qırmızı taxtapuşlu, ağ imarətin həyətində oynayan çoxlu uşağa sataşdı.* Ə.Vəliyev.

**TAXTA-ŞALBAN** *top.* Taxta və şalbandan ibarət tikinti materialı; taxta və şalban.

**TAXTAYONAN** *is.* Kələ-kötür taxtaları yonub hamar etmək üçün maşın. *Taxtayonanı işə salmaq.* // Sif. mənasında. [Yunis] *transportyorların ilişərək getdiyini görüb, cihazların, taxtayonan maşının yoxlanmasını əmr etdi.* Mir Cəlal.

**TAXT-RƏVAN** *is.* Keçmişdə: kübarları, əyanları, xüsusən onların qadınlarını bir yerdən başqa yerə aparmaq üçün nəqliyyat vasitəsi kimi istifadə edilən, iki və ya dörd adam tərəfindən qaldırılıb gəzdirilən evcik. *Sevda qara qulların daşıdığı taxt-rəvanda gələr, ətrafında saray qızları coşqun bir sevinclə şərqi söyləyərlər.* H.Cavid.

**TAXT-TAC, TAXTÜ TAC** *is.* Hakimiyyət, hökmdarlıq rəmzi olan taxt və tac. *Hikmət İsfahani çoxdan İran taxt-tacına göz dikmişdir.* M.İbrahimov.

**TAKELÁJ** [*holl.* takelage] 1. Gəmi iplərinin (kəndir və metal) hamısının bir yerdə adı.

2. *xüs.* Yükləmə-boşaltma və yükü yaxın məsafələrə aparmaq üçün istifadə edilən vasitələrin (iplərin, blokların, zəncirlərin, qurğuların) hamısı bir yerdə.

**TAKELAJÇI** *is.* Takelaj işləri görən fəhlə.

**TAKSİ** [*ing., fr.* taxi] Gedilən yolu və onun haqqını hesablamaq üçün sayğacı olan minik və ya yük avtomobili. *Taksi dayanacağı. Taksi şoferi. Taksidə işləmək.* – [Rəşid:] *Biz bulvardan çıxan kimi Bəkir taksi saxladı.* İ.Hüseynov.

**TAKSİÇİ** *is.* Taksi maşını sürücüsü, şoferi.

**TAKSİR** *is.* [*ing.*] Sayğacı olan minik və ya yük avtomobili.

**TAKSÓMETR** [*lat.* taxo və *yun.* metr] Yol haqqını hesablayıb göstərən taksi sayğacı.

**TAKSOMOTÓR** [*lat.* taxo və *lat.* motor] bax **taksi**. *Taksomotor parkı.*

**TAKT** [*alm.* Takt, əsli *lat.* tactus] bax **vəzn** 2-ci mənada.

**TAKTİK**[1] *sif.* [*yun.*] 1. Taktikaya aid olan, taktika ilə bağlı olan, döyüşü, vuruşu, ayrıca hərbi əməliyyatı aparmaqla əlaqədar olan. *Taktik məşğələlər. Taktik üstünlük. Qoşunun taktik keyfiyyəti.*

2. Taktika (2-ci mənada) ilə əlaqədar, taktika baxımından edilən. *Taktik nəticələr. Taktik hərəkət. Taktik prinsiplər. Taktik mülahizələr.*

**TÁKTİK**[2] [*yun.*] Hərbi taktikanı yaxşı bilən, taktika mütəxəssisi (bax **taktika** 1 və 2-ci mənalarda).

**TÁKTİKA** [*yun.* taktike] 1. Döyüşə hazırlıq və döyüşü aparmaq üsulları haqqında nəzəriyyə və praktika; döyüş vaxtı qoşun hissələrini idarəetmə üsulu. [Cavad] *..siyasi rəhbərlə birlikdə ocaq ətrafında toplanan döyüşçülərlə düşmənin taktikasını müzakirə etdi.* Ə.Vəliyev.

2. *məc.* İctimai, siyasi mübarizə aparma üsul və qaydaları. *Terror taktikası.* // İdmanda, idman oyunlarında tətbiq edilən üsul və qaydalar. *Şahmat taktikası.*

3. *məc.* Bir şeyi əldə etmək üçün istifadə edilən yollar və üsullar; birisinin götürdüyü hərəkət xətti. *Haşımov taktikanı dəyişdi.* R.Rza.

**TAQANÓK** [*rus.*] Xörək bişirmək, su qızdırmaq və s. üçün stol üzərində qurulmuş ikigözlü qaz cihazı; pilətə. *Taqanokda xörək bişirmək.*

**TAQƏT** *is.* [*ər.*] Güc, qüvvət. *Ustanın dili daha söz tutmurdu, ayaq üstə durmağa taqəti yox idi.* Çəmənzəminli. *Qışın taqəti yoxdur; Döyüşməyə baharla.* R.Rza. ☐ **Taqət qalmamaq** – bax **taqətdən düşmək**. *Artıq* [Qurbanın] *dizlərində taqət, vücudunda qüvvət qalmamışdı.* A.Şaiq. [Səriyyə:] *Mənim dəxi səbir etməyə taqətim qalmadı.* C.Cabbarlı. **Taqətdən düşmək** – gücdən düşmək, daha taqəti qalmamaq, üzülmək. *Qəribin getməsindən düz altı ay yarım keçmişdi, Qəribin anası da taqətdən düşmüşdü.* "Aşıq Qərib". [Sevinc:] *Az qala taqətdən düşüb yolda qalmışdı.* Z.Xəlil. **Taqətdən salmaq** – əldən salmaq, üzmək. *Saldı məni taqətdən ol afəti-dövranım.* Heyran xanım. *Aclıq, zəiflik bir tərəfdən, yorğunluq və qorxu digər tərəfdən zavallı uşağı taqətdən salmışdı.* S.S.Axundov. **Taqəti kəsilmək** – bax **taqətdən düşmək**. [Səriyyə:] *Ah, Rüstəm, ürəyim çatlayır! Taqətim kəsilir!* C.Cabbarlı. [Yaşlı kişi:] *Taqətim tamamilə kəsildiyi üçün paltarımı soyunmadan yatağa sərildim.* S.Hüseyn.

**TAQƏTSİZ** *sif.* və *zərf* Gücsüz, qüvvətsiz; əldən düşmüş (halda), üzgün (halda). [Dərviş:] *Ruqiyyə bu yana-o yana ilan kimi taqətsiz yollandı.* A.Divanbəyoğlu. [Aydın] *taqətsiz halda çarpayının üstünə yıxılıb ağır yuxuya getmişdi.* H.Seyidbəyli.

**TAQƏTSİZLİK** *is.* Gücsüzlük, qüvvətsizlik, heysizlik; üzgünlük. *Mən əsəbilik, taqətsizlikdən otura bilmədim.* Mir Cəlal.

**TAQIM** *is. köhn.* 1. Bax **vzvod**. *Uzunboylu, sarıbənizli, alagözlü taqım komandiri taqımı fişənglə təchiz edirdi.* H.Nəzərli. *Hacıyev taqım komandiri idi. Neçə aydı ki, taqımı ilə məşğul olur, onu öyrədir, döyüşə hazırlayır.* Ə.Əbülhəsən.

2. Bax **komplekt**. *Xəlilin qoltuğunda bir bağlı yataq taqımı və Əhmədin əllərində bişmiş, polis dairəsinə girdilər.* Çəmənzəminli.

3. "Bir" sözü ilə: **bir taqım** – 1) bir yığın, bir dəstə. [Yaşlı kişi:] *Şəhərin bir mənzilliyində mənimlə birlikdə gələn bir neçə zəvvarı bir taqım adamlar qarşıladılar.* S.Hüseyn; 2) bir miqdar, bir qədər, bir sıra, cürbəcür,

dürlü-dürlü. *Hər zaman Zeynal* [Mehribanı] *bir taqım quru və boş vədlərlə dolandırırdı*. S.Hüseyn. *Fəqət işin çoxluğundan bədii ədəbiyyata istədiyim qədər vaxt sərf edə bilmədiyimə görə, bir taqım yazılarımın hələ indi də natamam qalmasına təəssüf edirəm*. T.Ş.Simurq.

**TAQ(Q)** *təql.* Düşən və ya bir şeyə dəyən bərk şeylərin çıxardığı səs.

**TAQQANAQ** *sif. dan.* Çox quru, qupquru. *Taqqanaq çörək.*

**TAQQATAQ** *təql.* Davamlı taq-taq səsi. *Döyülür dabanlar yerə taqqataq; Gurultu, şaqqıltı... tutulur qulaq.* H.K.Sanılı.

**TAQQILDAMA** "Taqqıldamaq"dan *f.is.*

**TAQQILDAMAQ** *f.* Taqqıltı səsi çıxartmaq, taq(q) etmək. *Lap yaxında pəncərələrdən birinin qapısı açılıb taqqıldadı.* M.Hüseyn. // Döyülmək, taqqıldadılmaq, taqqıltı səsi çıxmaq. *Əminə darvazanın taqqıldadığını eşitdi, dərhal da bunun nə ola biləcəyini düşünüb darvazaya cumdu*. Ə.Əbülhəsən.

**TAQQILDATMA** "Taqqıldatmaq"dan *f.is.*

**TAQQILDATMAQ** *f.* Bir şeylə vuraraq taqqıltı səsi çıxartmaq; döymək. *İldırımzadə qapıya yanaşıb taqqıldatdı.* S.Rəhimov. *Təzə şəhər klubunun pəncərəsini içəridən taqqıldatdılar*. Mir Cəlal.

**TAQQILTI** *is.* Bərk bir şeyin bərk bir cismə toxunmasından çıxan səs, taq-taq səsi. [Əsgər bəy:] *Taqqıltı gəlir, çıx gör nədir, deyəsən, qonaqlar gəlirlər*. Ə.Haqverdiyev. [Qızın] *tuflilərinin taqqıltısı qaranlıq gecənin sükutunda qəribə səslənirdi.* H.Seyidbəyli.

**TAQ-TAQ** 1. *təql.* Dəmir, taxta və s. bu kimi bərk cisimlərin bir-birinə dəyməsi nəticəsində çıxan səs.

2. **Taq-taqla** şəklində *zərf* – taq-taq edərək, taq-taq səsi çıxararaq, taqqıldatmaqla. *Dəmirçinin ömrü taq-taqla, leyləyin ömrü laq-laqla keçər*. (Ata. sözü). *..Tulunbaların taq-taqla qalxıb düşməsi və qara neftin dağ çayları kimi şır-şırla axıb çənlərə tökülməsi .. ahəng və əzəmət təşkil edirdi*. B.Talıblı.

**TAL** *is.* [*holl.*] Yükqaldıran mexanizmlərin bir növü.

**TALA** *is.* Meşədə ağacsız, çılpaq yer, sahə; açıqlıq. *Kiçikbəyim fındıq və yemişan kollarını əyərək otlaq bir talaya çıxdı.* Çəmənzəminli. *Meşə qurtarırkən qarşılarında kiçik bir tala açıldı*. Ə.Məmmədxanlı.

**TALAQ** *is.* [*ər.*] *köhn.* 1. Boşama, boşanma, nikahı ləğv etmə. *Məşədi Qulamın talaq məsələsini aralığa qoymaması və hətta o barədə eşitmək belə istəməməsi Cavahirin ərdən çıxmasını daha artıq çətinləşdirirdi.* T.Ş.Simurq. ◻ **Talaq (talaqını) almaq** – boşanmaq, çıxmaq, ayrılmaq. [Kərbəlayı Qubad:] *Bəli, bu gün səndən talaq alacaqdır.* Ü.Hacıbəyov. **Talaq (talaqını) vermək** – boşamaq, çıxarmaq. [Nəbi:] *Elə sən, gəl, hacı, bu qızın talaqını ver.* Ə.Haqverdiyev. [Minnət xanım:] *Bu saat mənim talaqımı ver.* Ü.Hacıbəyov.

2. Kəbin kəsilərkən kişinin arvada verdiyi kəbin kağızınla qeyd edilən miqdarda məbləğ (pul). *Arvad bədbəxt olub atası evində qalardı. Atası da axund otağında, divanxanalarda kəbin və talaq davası edərdi.* H.Sarabski.

**TALAQLI** *sif. köhn.* Talaqı olan; kəbinli. *Talaqlı arvad.*

**TALAQSIZ** *sif. köhn.* Talaqı olmayan; kəbinsiz. *Talaqsız arvad.*

**TALALIQ** *is.* Meşədə ağacsız, açıq yer; tala, açıqlıq. *O biri tərəfdə qabaq-qənşər isə açıq talalıq idi*. S.Rəhimov.

**TALAMA** "Talamaq"dan *f.is.*

**TALAMAQ** *f.* Qarət etmək, çalıb-çapmaq, soyub talan etmək. *Oradan töküldülər bazara, tamam dükanları və karvansaraları taladılar.* M.F.Axundzadə. // Var-yoxunu güc, ya hiylə ilə əlindən almaq.

**TALAN** *is.* [*fars.*] 1. Qarət, çapovul, çapqın, soyğun. *Qabaqlarda dağlarda talan və qarətlə məşğul olan quldurlar çoxdan tutulmuşdur*. Ə.Vəliyev.

2. Əhalinin hər hansı milli və ya ictimai qrupuna qarşı mürtəce şovinistlərin quldurcasına çıxışı, onların mal-mülkünün qarət edilməsi və adamlarının öldürülməsi. *Şəhərdə talanlar başlandığı haqqında ciddi şayiələr buraxıldı.* M.S.Ordubadi. // *məc.* Soyğunçuluq. *Bu, alver deyil, talandır.* ◻ **Talan etmək** – b a x **talamaq**. *Xanlar, bəylər talan etmiş rəiyyətin yurdunu; Eyləyirlər mühafizə xain İran qurdunu.* A.Səhhət. **Talan olmaq** – b a x

**talanmaq**. *Züleyxa və Cəlil yenicə atasız qalmışlardı. Ataları kəndləri talan olan zaman öldürülmüşdü*. T.Ş.Simurq.

**TALANÇI** *is.* Talanla məşğul olan, talan edən; qarətkar, çapovulçu, çapqınçı, soyğunçu, quldur. *Araz talançı* (sif.) *adamı yaxşı tanımışdı*. A.Şaiq. *Zeynalın və o biri əlitüfənglilərin hədə-hərbəsi, başlarının üstündən güllə atması da bu talançılara kar eləmirdi*. Ə.Əbülhəsən.

**TALANÇILIQ** *is.* Talanla məşğul olma; soyğunçuluq, quldurluq.

**TALANMA** "Talanmaq"dan *f.is.*

**TALANMAQ** *məch.* Var-yoxu əlindən alınmaq, talan edilmək, talan olunmaq. *Bir evdə ki belə gözəl olmaya; O ev bərbad olub talanmaq gərək.* M.P.Vaqif. *Dağıldı ölkələr, talandı ellər; Sonalar oylağı tarü-mar oldu.* M.Müşfiq.

**TALÁNT** [*yun.* talanton] İstedad. *Bizə həyat gərəkdir! Bizə həyat gərəkdir! Həyat hər talant üçün su, hava və çörəkdir.* R.Rza. [Nərminə:] *Gələcək göstərər ki, böyük talant sahibi kimdir*. B.Bayramov.

**TALANTLI** *sif.* İstedadlı. [Elçin:] *Sevinc, Qaçay .. gənc ustaların ən talantlısıdırlar*. Z.Xəlil.

**TALASSEMİYA** *is.* [*yun.*] İrsi qan xəstəliyi.

**TALAŞA** *is.* Balta ağzından çıxan kiçik ağac, taxta parçaları. *Taxta zavodunda gecə-gündüz kəsilən, yonulan taxtaların talaşası .. böyük bir sahəni tuturdu.* Mir Cəlal. *Kiçik Fərman saatlarla atasının yanında durub ona tamaşa edər, onun mişarlayıb atdığı taxta parçaları və talaşalarla oynardı*. Ə.Sadıq.

**TALE** *is.* [*ər.*] 1. Bəxt, qismət. [Nazlı:] *Heç böylə padşah sarayında yaşayan bir xanım da taleyindən şikayət edərmi?* H.Cavid. [Kiçikbəyimin] *taleyə boyun əyməkdən başqa çarəsi yox idi*. Çəmənzəminli.

2. Müqəddərat, gələcək, iqbal. *Biçarə ana ölümünü deyil, əziz .. balalarının taleyinin necə olacağını fikir edib ağlayırdı*. C.Cabbarlı.

◊ **Tale ulduzu** – bax **bəxt ulduzu** ("**bəxt**"də). **Tale (taleyi) üz çevirmək** – uğursuzluğa uğramaq, işi bəd gətirmək, həyatında çətin və ağır dövr başlanmaq. *Yoxsa tale Salatından üz çevirmişdi?* Ə.Məmmədxanlı. **Taleyi gətirmək (açılmaq)** – bəxti gətirmək. [Əhməd:] *Qardaş, hər nə deyirsən de, bu almada bizim bəxtimiz var. Daha taleyimiz bu almaynan açılacaq*. (Nağıl). **Taleyi gülmək (gülümsəmək, üzünə gülmək)** – bəxti gətirmək, işi düz gətirmək. *Rəsmi bir yığıncaqda Tükəzban xalanın taleyi üzünə güldü və bir səslə birinci qadınlar qurultayına nümayəndə seçildi*. B.Talıblı. *Demək*, [Aslanın] *taleyi gülməyəcəkmiş! Aslan xoşbəxt deyilmiş!* S.Vəliyev. **Taleyindən (taleyə) küsmək** – öz bəxtindən küsmək, təqsir özündə olmaq. **Taleyini... bağlamaq** – gələcəyini, müqəddəratını birinə, ya bir şeyə, hadisəyə bağlamaq, özünü bir şeyə həsr etmək. **Taleyini kor qoymaq** – təqsir özündə olmaq, öz təqsiri üzündən müvəffəqiyyətsizliyə uğramaq. [Ayaz:] *Sən öz taleyini kor qoydun, ona mən neyləyim, – deyə, cavab verdi.* A.Şaiq.

**TALESİZ** *sif.* Bəxtsiz, bədbəxt, uğursuz. [Zeynal:] *Mən talesiz bir adamam*. S.Hüseyn. *Səfdər özünü yalnız ona görə bədbəxt və talesiz* (z.) *hesab edirdi ki, arvadı Rüxsara xanımın naxoşluğu uzanırdı və arzu etdiyi kimi tez tamam olmayırdı.* T.Ş.Simurq. // İs. mənasında. [Şeyda:] *Bəxtiyarların ölməsində, talesizlərin yaşamasında nə məna var?* H.Cavid.

**TALESİZLİK** *is.* Bədbəxtlik, bəxtsizlik, uğursuzluq. [Cəmil bəy:] *Of! Bəxtiyarlıq içində talesizlik, nə böyük fəlakət!* H.Cavid.

**TALEYİKƏM** *sif.* [*ər.* tale və *fars.* kəm] *köhn.* Bəxtsiz, bədbəxt. *Taleyikəm adam*.

**TALĞA** *is. məh.* Medal.

**TALXA** *is.* Sarı və qara xalları olan zəhərli ilan.

**TALIŞCA** *sif.* və *zərf* Talış dilində. *Talışca danışmaq*.

**TALIŞLAR** *cəm* Azərbaycanın cənub-şərqində və Cənubi Azərbaycanın şimal hissəsində yaşayan irandilli kiçik xalq və bu xalqa mənsub adamlar.

**TALİB** *is.* [*ər.*] *klas.* 1. İstəyən, birinə evlənmək istəyən oğlan, kişi və ya birinə ərə getmək istəyən qız, qadın. [Platon:] *İlk talib Xumar için hər kim; Hər kim olmuş olursa, rədd etməm*. H.Cavid. □ **Talib olmaq** – istəmək, evlənmək və ya ərə getmək istəmək. *Qız hər necə olsa yarə talib; Əlbəttə, gərək həyası qalib.* Füzuli.

2. Meyil edən, istəyən, həvəsində olan, arzusunda olan. *Mən nəinki bircə tuta, bəlkə də meyvəcatın heç birinə o qədər talib deyiləm.* C.Məmmədquluzadə. *Mən nura fəqət talibəm, atəş nəmə lazım*. H.Cavid.

**TALİBƏ** *is.* [*ər.*] Qız tələbə. *Ənisənin öhdəsinə bir vəzifə verilmişdi: söylənəcək təbrik nitqlərinə cavab olaraq talibələr tərəfindən cavab vermək*. S.Hüseyn.

**TALK** *is.* [*ər.*] Adətən toz halında təbabətdə və tibdə işlədilən ağ və ya göy rəngli yumşaq mineral.

**TALMUD** *is. qəd.* Yəhudilərin ehkamçı, dini-etik və hüquqi müddəalarının külliyatı.

**TALÓN** [*fr.*] 1. Bir şey almaq hüququ verən kiçik vərəqə şəklində sənəd; pətə. [Adil:] *Məktəbdə bir dəst paltar talonunu .. başqa bir şagirdə verib dükana yolladılar*. B.Bayramov.

2. Çek, order dəftərçəsinin kökündə qalan surəti (dublikatı).

3. Qiymətli kağızların (akkreditivin, aksiyaların və s.-nin) əsas hissəsi.

**TALVAR** *is.* 1. Günəşdən, yağışdan qorunmaq və ya başqa məqsədlər üçün dirəklər üzərində qurulmuş üstüörtülü kölgəlik; çardaq. *Talvarın altında yüyürək yelləyən; Qarı tez dikəldi salam səsinə*. B.Vahabzadə. *Dörd yöndəmsiz dirək üzərində qurulmuş talvarın üstündəki hər bir şey uzaqdan aydın seçilirdi*. Q.İlkin.

2. Evin girəcəyində qapıya yapışıq üstüörtülü yer. *Evin talvarı. – Mədəd idarənin qapısındakı talvarda oturmuşdu.* Ə.Vəliyev. // Ətrafı görmək üçün gözətçinin üstündə durduğu hündür tikili. *..Keşikçi talvarından başqa heç nə görünmürdü.* Ə.Əbülhəsən.

3. Tənək üçün dirəklər üzərində üstünə nazik taxtalar, borular düzülən və ya məftil çəkilən qurğu. *Üzüm talvarı. Tənəyi talvara çıxarmaq. – ..Talvarları bürümüş iri meynələr .. bağın gözəlliyini daha da artırırdı*. S.Vəliyev.

**TALVARLAMA** "Talvarlamaq"dan *f.is.*

**TALVARLAMAQ** *f.* Tənək üçün talvar düzəltmək; tənəyi talvara qaldırmaq. *Tənəkləri talvarlamaq*.

**TALVARLI** *sif.* Talvarı olan, talvar düzəldilmiş. *Talvarlı həyət. Talvarlı ev.*

**TAM**[1] *sif.* [*ər.*] 1. Başdan-başa, bütünlüklə, tamam, bütöv. *Tam qaranlıq.* // Mütləq, tamamilə, ən yüksək, ən mükəmməl. *Tam qələbə.* – [Çingiz:] *Tam bir müvəffəqiyyət əldə etmək üçün bütün tələblərimiz işə cəlb olunmalıdır.* Çəmənzəminli.

2. Vaxt bildirən saylardan əvvəl gələrək vaxtın bütövlüyünü, qalığı, kəsiri, əskiyi olmadığını bildirir; düz. *Tam bir saat gözlədim. – Məmmədbağır tam üç il olardı ki, Əsmərlə evlənmişdi.* S.Hüseyn.

3. Bütöv, bitmiş, qurtarmış, tamamlanmış (*natamam* əksi) . *Tam əsər.* // Heç bir şeylə məhdud edilməyən; qeyri-məhdud. *Tam hakimiyyət. Tam azadlıq vermək. Tam* (z.) *sahib olmaq*.

4. Müəyyən, lazımi ölçüdə, normada olan. *Tam metr. Tam iş günü*.

5. *riyaz.* Kəsri olmayan, kəsrlərdən ibarət olmayan. *Tamı tama bölmək. Tamdan kəsri çıxmaq*. □ **Tam ədəd** *riyaz.* – kəsri olmayan, yalnız tam(lar)dan ibarət ədəd. *Say prosesi ancaq tam ədədləri verir*. Z.Xəlilov.

◊ **Tam mənasında (mənasilə)** – tamamilə, bütünlüklə. *Dil tam mənasilə canlı bir orqanizmdir*. M.İbrahimov. *Fərmanı sözün tam mənasında gülərüz və xoşsifət adlandırmaq olardı*. Ə.Sadıq. **Tam məsuliyyətlə** – 1) bütün məsuliyyəti, cavabdehliyi öz üzərinə götürərək. *Tam məsuliyyətlə demək*; 2) bütün bacarığı ilə, bütün qüvvəsini sərf edərək. *Gənc oğlan bu etimadı yüksək qiymətləndirdi və tam məsuliyyətlə işə girişdi.* Ə.Sadıq. **Sözün tam mənasında** – b a x **tam mənasında (mənasilə)**.

**TAM**[2] [*ər.*] b a x **dad**[1] 1-ci mənada. *Telli kimi dadlı, ətirli, tamından doymaq olmayan xörək bişirən nəinki Çiçəklidə yox idi, hətta rayon mərkəzi İşıqlıda da bu barədə arasıra söhbət gedirdi*. Ə.Vəliyev.

**TAMADA** *is.* Qonaqlıqlarda, toylarda və s.-də məclisi idarə edən şəxs; süfrəbəyi, masabəyi. *Qüdrət toy məclisinin tamadası oldu.* M.Hüseyn.

**TAMADALIQ** *is.* Tamadanın işi; süfrəbəyilik, masabəyilik. [Nəsir bəy:] *Şərif, tamadalıq səninlədir..* M.Əliyev.

**TAMAH** *is.* [*ər.* təmə] Bir şeyi əldə etməyə göstərilən hədsiz arzu; hərislik, acgöz-

lük, bir şeydə gözü qalma. *Artıq tamah baş yarar*. (Ata. sözü). [Əliqulu:] *..Mənim dünya malına tamahım yoxdur*. S.S.Axundov.

◊ **Tamah dişini çəkmək** – vaz keçmək, gözünü çəkmək, əlini üzmək, ümidini kəsmək. **Tamaha düşmək** – acgözlüklə istəmək, həris olmaq. *Əyləşənlərin hamısı tamaha düşdü*. B.Bayramov. **Tamahı güc gətirmək (zor eləmək)** – tamahını, nəfsini saxlaya bilməmək, özünü saxlaya bilməmək, həddindən artıq tamahkarlıq göstərmək. [Kərəməli:] *Demədimmi yoldaşlarından ayrılma, tamahın güc gətirdi, gəldim*. M.F.Axundzadə. [Hacı Qara:] *Əlacım kəsildi, tamah zor elədi, dedim, bu bəylər ilə gedərəm Təbrizə*. Ə.Haqverdiyev.

**TAMAHKAR** *sif*. [*ər*. təmə və *fars*. ...kar] Hər şeyə tamah edən, hər şeydə gözü olan; varlanmağa, şey yığmağa həddən artıq həris olan; acgöz. [Qız:] *Əmim para düşkünü, tamahkar bir adam olduğundan, məni belə zəngin bir adama vermək istəyirdi*. S.Hüseyn. *..Əbülfət mirzənin və ümumiyyətlə Qacar şahzadələrinin tamahkar və rüşvətxor olduqlarını bilirdim*. M.S.Ordubadi. // İs. mənasında. *Tamahkarın biridir*.

**TAMAHKARLIQ** *is*. Tamahkar adamın xasiyyəti; hərislik, acgözlük. *Lakin Qətibənin özü onun tamahkarlığını bilirdi, deyilən sözlərin heç birisinə inanmırdı*. M.S.Ordubadi. [Allahqulunun] *tamahkarlığından Həmzə istifadə etməli idi*. Ə.Əbülhəsən.

**TAMAHLANDIRMA** "Tamahlandırmaq"dan *f.is*.

**TAMAHLANDIRMAQ** *f*. Tamaha salmaq, tamahsılandırmaq. *Sən məni lap tamahlandırdın*. S.Vəliyev.

**TAMAHLANMA** "Tamahlanmaq"dan *f.is*.

**TAMAHLANMAQ** *f*. Bir şeyi əldə etməyə, bir şeyə sahib olmağa həvəs göstərmək; nəfsini saxlaya bilməmək; tamahsılanmaq. *..Bu biçarə qızın zahiri çirkinliyi bir yana dursun, ..azacıq bir cehizi də yox idi ki, bəlkə də bəzi cavanlar canına görə də olmasa, malına görə tamahlanıb alsınlar*. B.Talıblı. *Arabaçı tamahlanıb arabasını yağ boçkaları ilə doldurduğundan arabanın təkərləri bərk cırıldayıb səslənirdi*. S.Rəhimov.

**TAMAHSILANDIRMA** "Tamahsılandırmaq"dan *f.is*.

**TAMAHSILANDIRMAQ** bax **tamahlandırmaq**.

**TAMAHSILANMA** "Tamahsılanmaq"dan *f.is*.

**TAMAHSILANMAQ** bax **tamahlanmaq**.

**TAMAHSIMA** "Tamahsımaq"dan *f.is*.

**TAMAHSIMAQ** bax **tamahsılanmaq**.

**TAMAHSITMA** "Tamahsıtmaq"dan *f.is*.

**TAMAHSITMAQ** bax **tamahsılandırmaq**.

**TAMAHSIZ** *sif*. Tamahı olmayan, heç bir şeydə gözü olmayan; gözütox, təmənnasız. *Tamahsız adam*.

**TAMAHSIZLIQ** *is*. Heç bir şeydə tamahı, təmənnası olmama.

**TAMAM** *is*. [*ər*.] 1. Bitmə, qurtarma, sona çatma, bitirmə. ☐ **Tamam etmək (eləmək)** – 1) qurtarmaq, bitirmək, axıra çatdırmaq, tamamlamaq. *Barışdırmaq rəsmini tamam edəndən sonra qonaqlar şüru etdilər çay içməyə*. Ə.Haqverdiyev. [Əsəd:] *Oxudum, dərsimi tamam etdim*. C.Cabbarlı; 2) *məc*. öldürmək, canını almaq. **Tamam olmaq** – 1) qurtarmaq, bitmək, tamamlanmaq. *Artıq Əlyar xanın ov dəstgahı tamam olmuşdu*. Ə.Məmmədxanlı. *İnsan dünyaya gəlir; Doqquz ay tamam olcaq*. B.Vahabzadə; 2) *məc*. ölmək, keçinmək. *Qulamhüseyn nökər başına çalıb deyirdi: – Ağam tamam oldu, qapımız bağlandı*. M.S.Ordubadi.

2. Tamamilə, bütünlüklə, büsbütün. *Otaqda adam xarici aləmi, sükutu, soyuğu tamam unudur*. Mir Cəlal. *..Eldar birdən ürəyinin sirrini tamam açmaqdan çəkinib, söhbəti dəyişmək istəyirmiş kimi, nəğməni kəsdi*. M.Rzaquluzadə.

3. Bütün, hamısı. *Meşənin tamam bülbülləri tarların səsinə cəm olmuşdular*. Ə.Haqverdiyev. *Bu iki ilin ərzində Səlim tamam işlərini düzəltdi*. İ.Musabəyov.

4. Bax **tam**[1] 2-ci mənada. *..Bu işin üstündən tamam üç il keçdi*. E.Sultanov. *Tamam beş gün beş gecə idi ki, gərgin mübarizə gedirdi*. S.Rəhimov. // Saatda dəqiqəni deyil, düz, tam saatı göstərir. *Tramvay yolunun üzərində bulunan elektrik saatını gecə saat iki tamamı göstərirdi*. S.Hüseyn. *Saat on iki tamamda katib .. direktorun gəldiyini söylədi*. B.Bayramov.

**TAMAM-DƏSGAH** b a x **dəsgah** 1-ci mənada.

**TAMAMƏN** [*ər.*] b a x **tamamilə**. *Bu yerin əhalisi tamamən seyiddilər.* Ə.Haqverdiyev.

**TAMAMİLƏ** *zərf* Tamam, tamamən, bütün olaraq, bütünlüklə; tamam-kamal. *Hələ bəzi vaxtlar Şərifə evə tamamilə əliboş qayıdırdı.* S.Hüseyn. *Bir azdan sonra günəş tamamilə buludların dalında qeyb oldu.* H.Seyidbəyli.

**TAMAM-KAMAL** *zərf* Tamamilə, bütünlüklə, bütün, tam və kəsirsiz. *Borcunu tamam-kamal ödədi. – Cahangir tamam-kamal başına gələn əhvalatı nağıl elədi.* (Nağıl).

**TAMAMLAMA** 1. "Tamamlamaq"dan *f.is.*

2. *is.* Əgər-əskiyini düzəltmə, kəm-kəsirini düzəldib, tam, bitmiş şəklə salma.

**TAMAMLAMAQ** *f.* 1. Tamam etmək, tam hala gətirmək, əlavə edib doldurmaq, bütövləşdirmək. ◻ **Bir-birini tamamlamaq** – bir tam, bir bütöv əmələ gətirmək, bir-birinə əlavə olmaq, tamlamaq. *Danışıqlar uzanır, zarafatlar, gülüşlər bir-birini tamamlayırdı.* Ə.Vəliyev.

2. Sona yetirmək, qurtarmaq, axıra çatdırmaq. *Kitabı oxuyub tamamlamaq. – Həcər sözünü tamamlayıb, gözünü yollara dikmişdi.* "Qaçaq Nəbi". *Bayram ehmalca gülümsündü. Mənə cavab verməyib öz fikrini tamamladı.* Ə.Vəliyev.

**TAMAMLANMA** "Tamamlanmaq"dan *f.is.*

**TAMAMLANMAQ** *məch.* 1. Tam hala gətirilmək, kəsir və nöqsanları aradan qaldırılmaq, çatışmayan yerləri düzəldilmək. *Ev tikilib tamamlandı.*

2. Tamam olmaq, sona yetirilmək, axıra çatdırılmaq, bitirilmək.

**TAMAMLAYICI** *sif.* Tamamlayan, yekunlaşdıran, bitirici, son, axır. *Məruzənin tamamlayıcı hissəsi*.

**TAMAMLIQ** *is.* 1. Tam şəkildə olma; tam, bütöv şeyin halı; tamlıq, bütünlük.

2. *qram*. Üzərində iş, hal və hərəkətin icra olunduğu obyekti bildirən ikinci dərəcəli cümlə üzvü. *Vasitəli tamamlıq. Tamamlıq daha çox isimlə ifadə olunur.*

**TAMARZI** *is.* [*ər.* təmə və *fars.* arzu] Yeməli, içməli bir şeyin arzusunda, həsrətində olma. *Kəndlinin uşağı isti xörəyə tamarzı idi.* Ə.Vəliyev. // Ümumiyyətlə, bir şeyin həsrətində olma. *Dünyada bir nemәti yoxdur ki, mən ona özümü tamarzı hesab edəm.* C.Məmmədquluzadə. *Hamı onunçun tamarzı idi,* [Cabbarlını] *bir dəfə görməkçün hamı həsrət çəkirdi*. S.Rəhman. // Belə bir arzuda, həsrətdə olan adam haqqında. *Zurna-qaval səsi düşür dağlara; Buna həsrət çəkir çox tamarzılar*. M.Müşfiq.

**TAMARZILIQ** *is.* Bir şeyin həsrətində, arzusunda olma; nisgillik. [Qönçənin] *qəlbində nisgil, tamarzılıq, qibtə bir-birinə qarışmışdı.* Ə.Vəliyev.

**TAMASA** *is.* Müxtəlif məqsədlər üçün yonulub hazırlanmış nazik ensiz taxta; reyka.

**TAMAŞA** *is.* [*fars.*] 1. Baxıb seyr etmə. *Siz hərəkət edən gəminin göyərtəsindən .. alçaq və uca dağların tamaşasına dalmağın zövqünü dadmısınızmı?* M.İbrahimov. ◻ **Tamaşa etmək (eləmək)** – 1) baxıb seyr etmək, baxmaq. *Axşam vaxtları kəndin kənarında durub yaşıl çəmənlərə tamaşa eləyəndə görürsən ki, naxır üz qoyub kəndə gəlməyə.* C.Məmmədquluzadə. *Nahardan sonra Bahadır pəncərədə oturub, qabağındakı meşəyə tamaşa edirdi.* N.Nərimanov; 2) diqqətlə nəzərdən keçirmək; bütün diqqətini toplayaraq baxmaq. *Şəha, müddət cəhanı mən də gəzdim, dərbədər gördüm; Tamaşa eylədim yaxşı-yamanı, xeyrü-şər gördüm.* M.V.Vidadi. *Hüsaməddin bunları deyəndən sonra sakit olub, Toğrulun nə kimi bir vəziyyət aldığına tamaşa edirdi.* M.S.Ordubadi. **Tamaşa qılmaq** *klas.* – b a x **tamaşa etmək**. *Dil zülfülə rüxsarüvə çün qıldı tamaşa; Avarə qalıb küfr ilə iman arasında*. Heyran xanım.

2. Görməli, baxmalı, tamaşa etməli, yaxud gəzməli yer, mərasim və s. *Xalı, xalça, palaz, fənər tanış evlərdən yığıb toyxananı döşərlər və lampaları yandırıb toya, tamaşaya yığışarlar*. R.Əfəndiyev. *Bu səhər Vahid Rübabəni Cıdır düzünə tamaşaya aparmalı idi.* Mir Cəlal. // Göz qabağında açılan mənzərə; seyrəngah. *Hər yamacda bir tamaşa; Könlüm uçur dağa-daşa.* M.Müşfiq.

3. Teatrda, sirkdə, kinoda və s.-də tamaşaçılara göstərilən şey. *Azərbaycanın qabaqcıl oğulları əsərə və tamaşaya yüksək qiymət vermişlər*. M.İbrahimov. *Tamaşanın ikinci*

*pərdəsi oynanırdı*. Mir Cəlal. □ **Tamaşa etmək** – teatr, kino, sirk tamaşasına baxmaq. "*Vaqif*"*ə tamaşa etmək. Baletə tamaşa etmək*. **Tamaşa zalı (salonu)** – teatr, kinoteatr, mədəniyyət sarayı və s.-də tamaşa göstərilən zal (salon). *Camaat tamaşa zalına axışırdı*. S.Rəhman. *Gülyanaq tamaşa zalına girəndə özünü başqa aləmdə hiss etdi*. Ə.Vəliyev. **Tamaşaya qoymaq** – səhnədə göstərmək, oynamaq. "*Koroğlu*" *operasını bir neçə rejissor tamaşaya qoymuşdur*. **Tamaşaya qoyulmaq** – oynanılmaq, səhnədə göstərilmək, səhnəyə qoyulmaq. *1926-cı ildə* "*Hamlet*" *Azərbaycan Dövlət Dram Teatrında tamaşaya qoyuldu*. M.Arif. "*Karmen*" *operası ilk dəfə tamaşaya qoyulurdu*. İ.Əfəndiyev.

◊ **Tamaşa elə** – hədə, xəbərdarlıq bildirir; bax..., görərsən... [Əhməd:] *Yaxşı, ata, indi mən yer deşiyindən pul çıxardım, sən də tamaşa elə!* Ə.Haqverdiyev. [Balaxanım:] *Hələ mən səni öz atımın dırnaqları altında tapdadanda tamaşa elə, Dadaş Lələşov!* S.Rəhimov.

**TAMAŞAÇI** *is*. 1. Teatr, kino, sirk və s. tamaşalara, yaxud televiziya verilişlərinə baxan adam. *Tamaşaçılarla görüş*. – *Tamaşaçılar Qaraca qızın gözəl səsinə və oynamasına təəccüb edib heyrətdə qalırdılar*. S.S.Axundov. *Tamaşaçılar arasında cürbəcür söhbətlər olurdu*. M.S.Ordubadi.

2. Bir işə qarışmayıb kənardan baxan, seyr edən adam; seyrçi. [Ənisə] .. *kənardan gəlmiş bir adam kimi hər işə tamaşaçı olurdu*. S.Hüseyn.

**TAMAŞAGAH** *is*. [*fars*.] *köhn*. Tamaşa yeri, teatr.

**TAMAŞAXANA** *is*. [*fars*.] Tamaşa göstərilən bina.

**TAMAŞALI** *sif*. 1. Tamaşa edilməyə, görməyə, baxmağa layiq; gözəlliyi ilə diqqəti cəlb edən; gözəl, qəşəng, maraqlı. *Tərlan tamaşalı, maral baxışlı; Qədəm qoyub asta-asta, xoş gəldin!* Aşıq Ələsgər. *Mən ümərələr bağının malıyam; Güllər arasında tamaşalıyam*. A.Səhhət. // Mənzərəli, baxmalı, axarbaxarlı. *Tamaşalı yerlər*. *Tamaşalı sahil*.

2. *məc. zar*. Hər hansı bir cəhətdən qəribə görünən; əcaib, təəccüblü. *Tamaşalı adam*. – *Veys bunlara baxır: – Ay dünya, – deyə, fikirləşirdi: – Sənin tamaşalı işlərin varmış*. Ə.Əbülhəsən.

**TÁMBUR** [*fr*. tambourin] Dəmiryol sərnişin vaqonunda hər tərəfi bağlı meydança. *Yer olmadığından sərnişinlərin bir çoxu tamburlarda dayanmışdı*.

**TAMBURİN** *is*. [*fr*.] Silindrik formalı kiçik təbil.

**TAMET** *is*. Tikinti materialı.

**TAMHÜQUQLU** *sif*. Bütün hüquqlara malik olan, hər cür hüququ olan. *Tamhüquqlu vətəndaşlar*.

**TAMHÜQUQLULUQ** *is*. Bütün hüquqlara malik olma, hər cür hüququ olma, tamhüquqlu olma.

**TAMLAMA** "Tamlamaq"dan *f.is*.

**TAMLAMAQ** bax **tamamlamaq**.

**TAMLI** *sif*. 1. Dadlı, ləzzətli. *Tamlı xörək*. *Tamlı yeməklər*.

2. Bir qədər başqa dad verən, başqa dadan, ...dadlı.

**TAMLIQ** *is*. Tam şeyin halı; tam halda olma; tamamlıq, bütünlük, bütövlü. *T.Məmmədovun bu heykəl qrupu tamlıq və möhtəşəmlik təsiri oyadır*. "İncəsənət".

**TAMMETRAJLI** *sif*. Kino. Bir seansda göstərilmək üçün kifayət qədər uzunluğu olan (kinolent, film haqqında).

**TAMPÓN** [*fr*.] bax **piltə** 2-ci mənada.

**TANA** *is*. 1. Sırğa. *Qızıl tana*. – *Qızıl üzük, zər bilərzik; Qulağında tana gəlir*. Aşıq Əli.

2. Texnikada: əsasən halqa və ya yarımhalqa şəklində müxtəlif birləşdirici detalların adı.

**TANIQ** *is*. *qəd*. Şahid.

**TANIMA** "Tanımaq"dan *f.is*.

**TANIMAQ** *f*. 1. Bir adamı, şeyi və s. görərkən, keçmişdə onunla tanış olduğunu, tanışlığını xatırlamaq. *Cəbhə dostunu tanımaq. Keçmiş sinif yoldaşını tanımaq*. // Tanış olmaq, tanışlığı olmaq. [Yaqut:] *Onu tanıyıram. Adı Yaşardır*. C.Cabbarlı. [Süleyman:] *Bəy, sən onun özünü tanımasan da, atasını yaxşı tanıyarsan*. Ü.Hacıbəyov. // Bilmək, başqalarından fərqləndirmək, kim olduğunu seçmək. *Sizi birdən-birə tanımadım. Bu adamı tanımadın? Yerişindən tanımaq*. – *Aslan Səlminaz arvadı səsindən tanıyıb, cəld pəncərəyə yanaşdı*. M.Hüseyn. // Ayırd edə bilmək, fərqləndirə bilmək, seçmək. Dostla *düşmə-*

*ni tanımaq. – Namərdlə mərdi tanı; El sevər mərd atanı; Oğul fərsiz çıxanda; Öldürər dərd atanı.* (Bayatı).

2. Bir adam və onun bütün xüsusiyyətləri haqqında aydın təsəvvürü olmaq, onu yaxşı bilmək. *Mən onu tanıyıram, o belə iş görməz. Sən hələ onu yaxşı tanımırsan.* – [Yusif:] *Elə ki mən* [Şamdan bəyi] *tanımışam, heç kəs tanımaz*. N.Nərimanov.

3. İtaət etmək, tabe olmaq. *Kiçik böyüyü tanımayanda iş görmək çətindir*.

4. Saymaq, əhəmiyyət vermək, hesablaşmaq. [İbrahim xan Məmməd bəyə:] *..Kəlbəli qudurub, məni tanımaq istəmir. Onun burnunu ovmaq lazımdır.* Çəmənzəminli.

5. *dipl*. Yeni dövləti rəsmi dövlət kimi qəbul edib, onunla diplomatik əlaqə yaratmaq. *Afrikada yaranmış yeni dövlətləri tanımaq.*

**TANIMAZLIQ** *is*.: **özünü tanımazlığa vurmaq (qoymaq)** – özünü tanımır kimi, tanış olmayan kimi göstərmək. *Əsli xan özünü tanımazlığa vurdu ki, qızlar bilməsinlər*. "Əsli və Kərəm".

**TANINMA** "Tanınmaq"dan *f.is*.

**TANINMAQ** "Tanımaq"dan *məch*. [Xaqani:] *Yazsaydım qəsidə əgər hər zaman; Şərqə tanınmazdı sevimli Şirvan.* M.Rahim. *Ağazal öz motosikletinin yanında durub, başına qazan kimi girdə papaq qoymuşdu, üzü yaxşı seçilmirdi, güclə tanınırdı*. Ə.Əbülhəsən.

**TANINMAZ** *zərf* və *sif.* 1. Tanınmayacaq dərəcədə dəyişmiş, tanınmayacaq şəklə düşmüş, çox dəyişilmiş, əvvəlki vəziyyətindən heç bir əsər-əlamət qalmamış. *Zavod tanınmaz dərəcədə genişləndiriləcəkdir.* ☐ **Tanınmaz olmaq** – tamamilə başqa şəklə düşmək, öz əvvəlki şəklini, görkəmini tamamilə itirmək. *Fabrikimiz tanınmaz olmuşdu. – Yeni şəhər aylar müddətində deyil, həftələr, günlər ərzində dəyişilir, böyüyüb artır və tanınmaz olur*. Ə.Sadıq.

2. Tanış olmayan, tanınmayan, tanına bilməyən. *Qız zənn edir, səfərdən gəlir knyaz; Birdən görür, bir qonaqdır tanınmaz*. A.Səhhət.

**TANINMAZLIQ** *is.* Tanınmaz şəklə düşmüş adamın və s.-nin halı.

**TANINMIŞ** *sif.* Məşhur, adlı-sanlı, ad qazanmış. *Tanınmış alim. Tanınmış artist. Tanınmış idmançı*. – [Fərman] *ölkənin məşhur, tanınmış qızı ilə yarışa girmişdi*. Ə.Sadıq.

**TANIŞ** *sif.* 1. Tanışlığı olan, əvvəllər görüşmüş, bir-birini tanıyan. *İndidən hər kəs ki tanış kəndlilərindən birinə rast gəlir, qaçıb kəndlinin qabağını kəsib deyir.* C.Məmmədquluzadə. [Şükür] *nazir ilə tanış bir parlaman üzvü tapdı.* S.Hüseyn. // *is.* Tanış adam. *Rast gəlir yenə də dostlar, tanışlar; Görüşür əl verib, öpüşürük biz.* S.Vurğun. *Qəhrəmanın Bakıda tanışı yox idi*. Ə.Vəliyev. ☐ **Tanış etmək** – 1) iki və ya bir neçə adamı bir-birinə təqdim edərək aralarında tanışlıq yaratmaq. [Murad] *məni yoldaşı Badisəba xanımla tanış etdi.* Çəmənzəminli. [Gülsabah Qüdrətə:] *Siz məni heç kəslə tanış etmədiniz, hamısını bir-bir özüm soruşmalıyam?* C.Cabbarlı; 2) bir şey haqqında məlumat verərək, danışaraq, göstərərək birində təsəvvür oyatmaq, məlum etmək. *Döyüşçüləri vəziyyətlə tanış etmək*. **Tanış olmaq** – 1) birisi ilə və ya bir şeylə tanışlıq əldə etmək, bir-birini tanımaq, aralarında ülfət yaranmaq. [Balaş:] *Xalq öz işində, gücündə, gedim tutum ki, gəl mənim arvadım* [Dilbər] *ilə tanış ol?* C.Cabbarlı. *Siz kənarda dayanmayın, bir yaxın gəlin; Qayıqdakı üç nəfərlə tanış olaq biz.* Ə.Əlibəyli; 2) bir şey haqqında məlumat almaq, bilik əldə etmək, bələd olmaq. *Klassik musiqi ilə tanış olmaq*. – *İş ilə tanış olandan sonra Vahidi axırıncı dəfə rəis özü dindirdi.* Mir Cəlal.

2. Qabaqlar təsadüf olunmuş; məlum, bələd. *Tahir .. tanış həyatlərə göz gəzdirir, qohum-əqrəbaya rast gələcəyini düşünə-düşünə irəliləyirdi.* M.Hüseyn. *Tanış bir səs nagahani bir zərbə kimi* [Gülnazı] *sarsıtdı*. M.İbrahimov.

◊ **Tanış gəlmək** – qabaqlar tanış olduğu halda yaxşı tanıya bilməmək, tanış kimi görünmək. *Bu səs Məmmədə tanış gəldi.* M.S.Ordubadi. *Qadının yerişi, bədəninin hərəkəti mənə tanış gəlirdi*. S.S.Axundov.

**TANIŞ-BİLİŞ** *top.* Birisinin tanıdığı adam(lar); dost(lar), tanış(lar), yaxın adam(lar). *Məsmənin yanına bir çox tanış-bilişləri gəlirmiş*. S.Hüseyn. [Gövhər xanım:] *Bu boyda şəhərdə zəng eləmədiyim tanış-biliş qalmayıb*. İ.Hüseynov.

**TANIŞDIRMA** "Tanışdırmaq"dan *f.is.*

**TANIŞDIRMAQ** *f.* Tanış eləmək. [Aydın Surxaya:] *Sən niyə məni* [Gültəkinlə] *tanışdırdın, niyə?* C.Cabbarlı.

**TANIŞLIQ** *is.* Tanışların bir-birinə münasibəti, tanış olma. *Şahmar hələ tanışlıqlarının ilk günlərində .. Nərminəni özündən bircə an da ayrı təsəvvür etmirdi.* B.Bayramov. // Yaxınlıq, bələdlik; ünsiyyət. *Könlümün səninlə tanışlığı var; O səni gördükcə təsəlli duyar.* Ə.Cavad. ☐ **Tanışlıq vermək** – özü haqqında məlumat vermək və ya əvvəllər tanış olduqlarını xatırlatmaq, kim, nəçi olduğunu bildirmək. [Leytenant:] *Bəs niyə bayaqdan tanışlıq vermirsiniz?* İ.Əfəndiyev. *Fərəcov sədrin susduğunu görüb tanışlıq verdi.* B.Bayramov.

**TANIŞMA** "Tanışmaq"dan *f.is.*

**TANIŞMAQ** *qarş.* 1. Bir-biri ilə tanış olmaq. // Görüşmək, əlaqə saxlamaq, aralarında ülfət yaranmaq. *Fatma çox görmüşdü ki, oğlan özgə vilayətlərdə biri ilə tanışır.* Mir Cəlal.

2. *məc.* Tanış olmaq, məşğul olmaq. *Gah yazır, gah oxuyur, gah danışır; Gündə bir hərzə kitabnan tanışır.* M.Ə.Sabir.

**TANIŞ-TUNUŞ** *dan.* bax **tanış-biliş**. *Danışıqlar çox idi və tanış-tunuş da komandan dəftərxanasının qarşısına toplanmışdı.* B.Talıblı.

**TANITDIRMA** "Tanıtdırmaq"dan *f.is.*

**TANITDIRMAQ** *f.* 1. Tanış olduğunu bildirmək, bir-birlərini tanıdıqlarını bildirmək; tanışlıq vermək. [Hümmət] *..əvvəlcə səs eləyib, özünü itə tanıtdırardı.* B.Bayramov.

2. Məşhurlaşdırmaq, ad-san qazandırmaq. *Pyes dramaturqu xalqa tanıtdırdı.*

**TANITMA** "Tanıtmaq"dan *f.is.*

**TANITMAQ** *f.* 1. Tanış etmək, kim olduğunu bildirmək, tanışlıq vermək. *İndi bizə lazımdır ki, Yusif Sərracı tanıdaq ki, kimdir?* M.F.Axundzadə. *Kimdir axı, adı nədir? Tanıt bir bu adamı.* N.Rəfibəyli.

2. Məşhurlaşdırmaq, şöhrətini yaymaq, adını yaymaq, populyarlaşdırmaq. [Cavanşir:] *Ağvanın həkimi, heykəltəraşı, ozanı Odlar yurdunun şöhrətini bütün dünyaya tanıtmadıqca mənim ürəyim rahat döyünməyəcək.* M.Hüseyn.

**TANİN** *is.* [*fr.*] Dəri aşılanmasında, yazı mürəkkəbi istehsalında və s. istifadə olunan bitki mənşəli aşılayıcı maddə.

**TANK**[1] [*ing.*] Çətin keçilən yerlərdə hərəkət edə bilən, top və pulemyotlarla silahlanmış tırtıllı zirehli döyüş maşını. *Tank qoşunları. Tankların hücumu. – Tanklardan açılan sürəkli pulemyot atəşi dərələrə səs saldı.* M.Hüseyn.

**TANK**[2] [*ing.*] *xüs.* Mayeləri saxlamaq və ya daşımaq üçün xüsusi şəkildə düzəldilmiş bak, sistern və s.

**TANKÇI** *is.* Tank qoşunlarında xidmət edən hərbi qulluqçu.

**TÁNKER** [*ing.*] Maye yükləri daşımaq üçün böyük gəmi (bu gəmilərdə neft və s. mayelər birbaşa gəminin bölmələrə – tanklara ayrılmış korpusuna tökülür). *Ağır-ağır hərəkət edən böyük sahil kranları, gəmilər, tankerlər, ..dəniz üzərində şəbəkə kimi yüksələn yaxın və uzaq buruqlar qəribə seyrək meşəyə bənzəyirdi.* H.Seyidbəyli.

**TANKÉT(KA)**[1] [*rus.*, əsli *ing.*] Pulemyotlarla silahlanmış itigedən kiçik tank.

**TANKÉTKA**[2] [*rus.*, əsli *ing.*] *dan.* Altlığı pəncədən dabana doğru getdikcə qalınlaşan yüngül ayaqqabı.

**TANKQAYIRAN** *sif.* Tank qayırmaqla məşğul olan. *Tankqayıran zavod.*

**TANKQAYIRMA** *is.* Tank və ya tank üçün alət və cihazlar qayırmaq sahəsinə aid (zavod və s.) *Tankqayırma sənayesi.*

**TANKODRÓM** [*ing.* tank və *yun.* dromos] Tankları sınaqdan keçirmək və tankçılarla təlim keçmək üçün xüsusi yer.

**TANKVURAN** *sif.* Düşmən tanklarını vurmaq üçün işlədilən. *Burada bir dəstə əsgər avtomatı, ikinci dəstə tankvuran silahı öyrənirdi.* Ə.Əbülhəsən.

**TANQAH** *is. köhn.* Pul, var-dövlət, dövlət. *..Qasımdan sonra ailəsi üçün nəinki heç bir tanqah qalmamışdı, hətta kişinin uzun müddət işsiz və naxoş olması və axırda ölməsi ailəni böyük borca salmışdı.* T.Ş.Simurq.

**TANQAHLI** *sif. köhn.* Tanqahı olan; varlı, dövlətli, pullu.

**TÁNQO** [*isp.* tango] Ağır-ağır oynanılan ikibölgülü rəqs və həmin rəqsin musiqisi.

**TANRI** *is.* Allah. [Elxan:] *Mənim tanrım başqalarına zərər verməz azad diləklərimdir.* C.Cabbarlı.

◊ **Tanrı bəndəsi** – bax **Allah bəndəsi** (“**Allah**”da). [Nənəxanım:] [Şaqqulunun] *özünün də avara gəzdiyi bəsdir, gedim, bir tanrı bəndəsinin qızını gətirim, bəlkə küçələrdən daşına*. Çəmənzəminli. **Tanrı bilir** – bax **Allah bilir** (“**Allah**”da). [Əmrah:] *İllər ilən gözüm baxsa gözünə; Tanrı bilir, səndən dönən deyiləm.* “Əmrah”. **Tanrı qoysa** – arzu bildirir. **Tanrının verən günü** – bax **Allahın verən günü** (“**Allah**”da). **Tanrısına təpik atmaq** – qudurmuş, yolunu azmış, naşükür, nankor adam haqqında. [Anası qızına:] *Adam tanrısına təpik atmaz*. Ə.Haqverdiyev. **Tanrıya bax!** – bax **Allaha bax!** (“**Allah**”da). *Əqlə gəl, tanrıya bax, eyləmə qəflət, Hadi.* S.Ə.Şirvani. **Tanrıya şükür** – bax **Allaha şükür** (“**Allah**”da). **Sən (siz, sizi) tanrı** – bax **sən (siz) allah** (“**Allah**”da). *Sizi tanrı, bircə dürüst diqqət ilə hesab ediniz.* N.Vəzirov.

**TANRIÇI** *sif. köhn.* Allahpərəst, Allaha inanan, mömin. [Molla Əkbər:] *Bu, tarçı Əsəd deyildi... tanrıçı Əsəd idi... Yaxşı adam idi...* B.Talıblı.

**TANTAL** *is.* [*lat.*] Elementlərin dövrü sisteminin V qrupundan Ta-kimyəvi element.

**TAP** *təql.* Yuxarıdan düşən şeyin çıxardığı səs.

**tap-tap, tap-tup** *təql.* Təkrarlanan “tap” səsi. *Ayaqların tap-tupu arasından yalnız bu sözləri eşitmək olurdu.* B.Talıblı.

**TAPAN** *is.* 1. Qırı, asfaltı, torpağı döyəcləyib bərkitmək və hamarlamaq üçün ortasına dəstə vurulmuş qalın taxta parçasından ibarət alət; döyəc. *Tapanla asfaltı tapanlamaq.*

2. Müxtəlif hörgülərdə hissələri bir-birinə bənd etmək üçün qurşaq.

**TAPANÇA** *is.* Müxtəlif sistemli odlu kiçik əl silahı. *Tapança atmaq. Tapança patronu. Tapança qoburu. – Tərlan özünü itirməyib cibindəki tapançasını çıxartdı.* M.Hüseyn.

◊ **Tapança kimi açılmaq** – bax **barıt kimi açılmaq** (“**barıt**”da).

**TAPANÇALI** *sif.* Tapança ilə silahlanmış, tapançası olan. *Əlləri tapançalı cavanlar otağa girdilər..* Çəmənzəminli. *..Kişilər içəri, Veysin yanına girdilər. Bunlardan tək-tək tüfənglisi, tapançalısı da vardı.* Ə.Əbülhəsən.

**TAPANLAMA** “Tapanlamaq”dan *f.is.*

**TAPANLAMAQ** *f.* Tapanla döyəcləyib bərkitmək və hamarlamaq. *..Torpağı Səriyyənin dediyi kimi tapanlayıb səpinə hazırlamışdılar.* M.Hüseyn.

**TAPDAQ** *is.* Üstündə çox gəzməkdən, tapdalanmaqdan bərkimiş yer. *Tapdaq yer.*

◊ **Tapdaq olmaq** *məc.* – ayaqları altında qalmaq, tapdalanmaq, işğal olunmaq, tutulmaq. *Yurdum-yuvam yadlara tapdaq olmasın deyə; Dizə qədər su dolmuş palçıq səngərdə yatdım..* S.Rüstəm. *Bilsin yaxın, uzaq, bəd ayaqda da; Bu vətən baş əyib tapdaq olmadı.* H.Hüseynzadə.

**TAPDALAMA** “Tapdalamaq”dan *f.is.*

**TAPDALAMAQ** *f.* 1. Ayaqlamaq, ayağı ilə basdalamaq. *Müəllim ayağı ilə qarı tapdalayıb Telli üçün yol açırdı.* S.Hüseyn. *İnəklər bütün sahəni tapdalaya bilərdi.* Ə.Vəliyev. // Ayağı ilə basıb əzmək. *Bu zaman Xasay pencəyini ayaqları altına salıb tapdalamağa, alovu söndürməyə başladı.* Ə.Vəliyev. *..Xəlil onun ardınca baxdı, papirosun kötüyünü yerə çırpıb, ayağı altında tapdaladı.* M.Hüseyn.

2. *məc.* Qabacasına saymazlıq göstərmək, heç yerinə qoymaq; saymamaq. *Maya Rüstəm kişinin çoxdan alışdığı, qanına, iliyinə işləmiş adət və təsəvvürləri tapdalamışdı.* M.İbrahimov.

**TAPDALANMA** “Tapdalanmaq”dan *f.is.*

**TAPDALANMAQ** *məch.* 1. Ayaqlanmaq, ayaqla basdalanmaq, tapdanmaq. *..Həyət ağır ayaqlarla tapdalandığından xırman kimi çılpaq və qurudur.* Mir Cəlal.

2. *məc.* Sayılmamaq, saymazlıq göstərilmək.

**TAPDAMA** “Tapdamaq”dan *f.is.*

**TAPDAMAQ** bax **tapdalamaq**. *Düşünür asta-asta: küçələr, ay küçələr! Mən sizin sinənizi tapdamışam nə qədər.* B.Vahabzadə.

**TAPDANMA** “Tapdanmaq”dan *f.is.*

**TAPDANMAQ** bax **tapdalanmaq**. *Evlər, damlar, taxtapuşlar gümüş kimi ağarır; Qar tapdanıb, palçıq olub, dağda cığır qaralır.* A.Səhhət. *Torpaq tapdanıb bərkimişdi.* Ə.Məmmədxanlı.

**TAPDIQ** *is.* 1. Gözlənmədən tapılan, ələ keçirilən şey. *Bu kitab lap tapdıq oldu*.

2. *məc.* Təəccüb doğuran, təəccüblü, əcaib, qəribə. *Tapdıq şey*.

**TAPDIRMA** "Tapdırmaq"dan *f.is.*

**TAPDIRMAQ** *icb.* Tapmağa məcbur etmək, tapmağı tapşırmaq, başqası vasitəsilə əldə etmək. *Çənlibeldi mənə pənah; Tapdıraram həkim, cərrah*. "Koroğlu". [Hacı mərsiyəxana:] *Ağa, qırqovuldan meyil buyurun, onu .. sizin üçün tapdırmışam*. Çəmənzəminli.

**TAPILMA** "Tapılmaq"dan *f.is. Tapdığın tapılmasında ər və arvad od ayaqlamışdılar*. Ə.Vəliyev.

**TAPILMAQ** "Tapmaq"dan *məch. İtən şey tapıldı. Axtardığım adam tapıldı. Meşədə azmış uşaqlar tapıldı. Xəstəliyə qarşı yeni dərmanlar tapılmışdır. Zəngin neft yataqları tapılmışdır. Mənim ayağıma ayaqqabı çətin tapılır*.

**TAPINMA** 1. "Tapınmaq"dan *f.is.*

2. *is.* Sitayiş, səcdə, pərəstiş.

**TAPINMAQ** *f.* 1. Səcdə etmək, sitayiş etmək, ibadət etmək, pərəstiş etmək. [Xəyyam:] *Bir tanrıya lazımsa tapınmaq; Zövq əhli tapınsın sana birdən*. H.Cavid. [Elxan:] *..Bütün varlıq mənim qılıncıma deyil, azad diləklərə, azad vicdanlara tapınmalıdır*. C.Cabbarlı.

2. *məc.* Pərəstiş dərəcəsində sevmək, məftun olmaq. *Gözəlliyə tapındığı o gündən bəri; Bir başqalıq duyulmaqda onun səsində.* Ə.Cavad. *Mən qapandığım, tapındığım hissiz, sükut aləmindən qayıdıram*. Mir Cəlal.

**TAPINTI** *is.* Tapılan şey. *Arxeoloji tapıntılar*.

**TAPIŞMA** "Tapışmaq"dan *f.is.*

**TAPIŞMAQ** *qarş.* 1. Bir-birini tapmaq, bir-biri ilə görüşmək. *Gün gələr, yenə də biz tapışarıq; Qucaqlar hər ana qalib oğlunu.* R.Rza. *Elə bil ki, iki həsrət, iki nisgil tapışdı; Qız əlilə şinelimin düyməsindən yapışdı.* Ə.Cəmil.

2. Dostlaşmaq, yaxınlaşmaq, bir-birini tapmaq, bir məqsəd üçün birləşmək (adətən xasiyyətcə, meyil və niyyətləri bir-birinə uyğun olan adamlar haqqında). *Həriflər tapışdılar*. – *Piri kişi həmişə* [Qaraca qızla qara köpəyi] *bir yerdə görəndə gülüb deyirdi: – İki qara yaxşı tapışmısınız*. S.S.Axundov.

**TAPQI, TAPQINTI** b a x **tapıntı**. *Veys bu yeni tapqılara sevinir*. Ə.Əbülhəsən.

**TAPQIR** *is.* Atın belində yəhərin dal tərəfə sürüşməməsi və yanlara əyilməməsi üçün döşünün altından keçirilən qayış. *Oğlan atdan düşdü, yüyənin kəmini atın ağzından çıxarıb, tapqırını boşaltdı, otlamağa buraxdı*. Çəmənzəminli. *Yüyəni, tapqırı bütün yağladı; Qantarğaya təzə qayış bağladı*. H.K.Sanılı.

**TAPMA** "Tapmaq"dan *f.is.*

**TAPMACA** *is.* 1. Hər hansı bir şeyi və ya hadisəni bənzətmə yolu ilə, qəsdən üstüörtülü şəkildə təsvir edən yığcam məcazi ifadədən ibarət müəmma (şifahi xalq ədəbiyyatı növlərindən biri). *Yusif əmi hər gecə bizə şirin-şirin nağıllar danışar, çox qəribə tapmacalar deyərdi.* A.Şaiq.

2. *məc*. Aydın olmayan və ya qeyri-müəyyən, üstüörtülü söz, məsələ, danışıq; müəmma. *Bu məsələ mənim üçün bir tapmacadır*. – [Cəbrayıl Firəngizə:] *Mənim heç uşaqlıqdan tapmaca ilə aram olmayıb*. B.Bayramov.

**TAPMACALAMA** "Tapmacalamaq"dan *f.is.*

**TAPMACALAMAQ** *f.* Qeyri-müəyyən, üstüörtülü danışmaq, müəmmalı söz demək. *Usta Ramazan yalnız böyründəki adamların eşidə biləcəyi bir səslə tapmacaladısa da, hamı onun sözünü eşitdi*. M.Hüseyn.

**TAPMACALI** *sif.* Qeyri-müəyyən, üstüörtülü, müəmmalı (söz, danışıq və s. haqqında). *Tapmacalı söz.*

**TAPPADAN** *zərf* Tap səsi çıxararaq, tap edərək, tappıltı ilə. *Birdən* [dəli] *yenə tappadan yerə yıxıldı və dırnaqları ilə torpağı eşərək ağladı.* M.İbrahimov.

**TAPMAQ** *f.* 1. Axtarış, aramaq nəticəsində meydana çıxarmaq, üzə çıxarmaq, əldə etmək. *Axtardığı kitabı tapmaq*. – *Gəzib güclə bir qapı tapa bildim*. S.Rəhman. *Əlində zərf gəzib tapır ünvanı; Qaynayıb, başına vurur al qanı.* M.Rahim. // Eyni mənada adam haqqında. [Sultan bəy:] *Axır gəlib səni tapdım, maralım, maralım, dilbilməz!* Ü.Hacıbəyov. [Mərcan:] *Tapmısan, tut ətəyindən, bərk tut; Başqa dilbərləri artıq sən unut!* A.Şaiq.

// İtirdiyi və ya bir yerdə unutduğu şeyi təzədən əldə etmək, özünə qaytarmaq. *İtirdiyi pulu tapmaq. Açarı stolun yeşiyindən tapmaq.* // Eyni mənada itkin düşmüş və ya yeri məlum olmayan adam haqqında. *Oğlunu tapmaq. – ..Millətlər yuxudan oyanıb gözlərini açdılar və pərakəndə düşmüş qardaşlarını tapıb, dağılmış evlərini bina etməyə üz qoydular.* C.Məmmədquluzadə. [Qəndab:] *Məzahiri tapıb salamat olduğunu bildim.* B.Bayramov. // Əldə etmək, ələ keçirmək. [Səlim qızı:] *Biz bu kənddə iki nəfər kimsəsiz... yavan çörək, onu da güclə tapırıq..* C.Cabbarlı. [Fərhad] *sağ cibini qurdaladı. Bir loğma quru qara çörək tapdı.* Ə.Vəliyev. // Xüsusi tədqiqat, araşdırma, axtarış nəticəsində aşkara çıxarmaq, açmaq, kəşf etmək. *Qazdan kauçuk almaq üsulunu tapmaq. Yeni neft yataqları tapmaq. – ..Bəzi naxoşların qanında bakteri və mikrob adlı xırda heyvanat və ələfiyyət tapdılar ki, onlar çirkab və qeyri natəmiz yerlərdə nəşvü nüma edirlər.* H.Zərdabi. // Hesablayaraq, fikirləşərək bir şeyin nəticəsini, cavabını müəyyən etmək, əldə etmək. *Məsələnin cavabını tapmaq. Sözün kökünü tapmaq.*

2. Çox axtararaq axırda əldə etmək; tapıb almaq. *Ayağıma, nəhayət, ayaqqabı tapdım. – Neft səltənəti Bakıda neft tapmaq əzablı bir işə çevrilmişdi.* A.Şaiq.

3. *məc.* Görmək, hiss etmək. *Tahir bu balacaboy uşağın varlığında suçu uşaqların kədər və iztirablarını tapırdı.* S.Rəhimov. [Bibixanım] *elə bir xüsusiyyət tapa bilmirdi ki, xoşuna gəlməsin.* B.Bayramov. // *məc.* Birini hər hansı bir vəziyyətdə, halda görmək. *Atasını xəstə halında tapdı.* // *məc.* Əldə etmək, nail olmaq. [Gəldiyev] *illərdən bəri arzuladığı "normal" həyatı tapmışdı.* Mir Cəlal.

4. Danışılan bir sözə və s.-yə istehzalı münasibət bildirir. *Deməyə söz tapmısan! Tərifləməyə adam tapdınız!*

5. Bir sıra isimlərdən sonra gələrək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: fürsət tapmaq, macal tapmaq, söz tapmaq, nöqsan tapmaq, yol tapmaq və s.

**TAPPATAP, TAPPATUP** 1. *təql.* Bir-birinə və ya başqa şeyə toxunan taxta və s. şeylərdən çıxan aramsız səs. *Ağarzanın evindən tappatap səsi gəlirdi.* Mir Cəlal.

2. *zərf* Tappıltı ilə, ayaqlarını tappıldada-tappıldada. *Bir qorodovoy küçənin ortası ilə tappatup gəlib çamadanın yanından sovuşdu.* S.M.Qənizadə.

**TAPPATAPLA, TAPPATUPLA** *zərf* Tappıltı ilə. *Alma-armud ağaclarından meyvələr tappatapla tökülürdü.* S.Rəhimov.

**TAPPILDAMA** "Tappıldamaq"dan *f.is.*

**TAPPILDAMAQ** *f.* Tappıltı səsi çıxarmaq, tap-tap etmək. *Boz at quyruğunu buladıqca xurcuna dəyir və taqqıldayırdı.* S.Rəhimov.

**TAPPILDATMA** "Tappıldatmaq"dan *f.is.*

**TAPPILDATMAQ** *f.* Bir şeyi bir şeyə vuraraq və ya yerə ataraq tappıltı səsi çıxartmaq.

**TAPPILTI** *təql.* 1. Hərəkət edən insan və ya heyvanın ayağının yerə dəyməsi nəticəsində çıxan səs. [Zeynal] *bir qədər sonra qapı arxasında ayaq tappıltısı duydu.* S.Hüseyn. *Bayramın qulağına at ayaqlarının tappıltısı dəydi.* M.Hüseyn.

2. Bir şeyin düşməsindən və ya başqa bir şeyə dəyməsindən hasil olan qısa qırıq səs və ya dalbadal eşidilən belə səslər. *Yaşıl qapı açılıb tappıltı ilə divara dəydi.* H.Seyidbəyli. [Aynanın] *sanki kömək istəyən əlləri bir an havada asılı qalıb, tappıltı ilə yanına düşdü.* İ.Hüseynov.

**TAPŞIRIQ** *is.* 1. Tapşırılmış şey, yerinə yetirilməsi, ifa və ya həll edilməsi bir vəzifə olaraq həvalə edilmiş iş, məsələ və s. *İctimai tapşırıq. Partiya tapşırığı.*

2. İşin qabaqcadan müəyyən olunmuş və ya göstərilmiş həcmi. *İstehsalat tapşırıqları. – ..Briqadirlər sabahkı iş üçün fikirləşir, manqabaşçıları səhərki tapşırığı üzvlərinə xəbər verirlər.* Ə.Vəliyev. // Dərsdənkənar vaxtda öyrənmək və ya həll etmək üçün şagirdlərə verilən dərs. *Həndəsədən tapşırıq. Ev tapşırığı. Tapşırığı yazmaq.* // Göstəriş, əmr, sərəncam. *Direktorun tapşırığı.* – [Xanlar:] *Mən atamın tapşırığını yerinə yetirməyə çalışaram, – dedi.* S.Rəhimov. // *hərb.* Operativ vəzifə. *İskəndər Quliyev döyüş tapşırığını döyüşçülərə başa saldıqdan sonra qərargaha qayıtdı.* Ə.Vəliyev.

**TAPŞIRILMA** "Tapşırılmaq"dan *f.is.*

**TAPŞIRILMAQ** "Tapşırmaq"dan *məch.* *Vəzifə tapşırılmaq. Siyahıların tutulması ona*

*tapşırılmışdır. – Bütün kisələri aparanlara* "*qonşunla bölüşdürəcəksən*" *deyilib, möhkəm tapşırılırdı*. Ə.Əbülhəsən.

**TAPŞIRMA** "Tapşırmaq"dan *f.is.*

**TAPŞIRMAQ** *f.* 1. Həvalə etmək, üzərinə qoymaq. *Səadət xanım Səriyyə xala və Gülnaza bəzi işlər tapşırdı.* M.İbrahimov. *Sədəf xala təzəcə yoldan gəldiyindən çay hazırlamağı Sürmə xalaya tapşırmışdı*. S.Rəhman.

2. Birisinin və ya bir şeyin qayğısına, qeydinə qalmağı həvalə etmək; inanaraq, etibar edərək öhdəsinə buraxmaq, himayəsinə buraxmaq; qızmaq. *Ona şey tapşırmaq olmaz. – Əmioğlumun peşəsi qoyun saxlamaq idi və qoyunları da .. çobanlara tapşırmışdı*. C.Məmmədquluzadə. [Afaq:] *İlyas, körpə Məmmədimi sənə tapşırıb gedirəm, – dedi..* Ə.Məmmədxanlı.

◊ **Torpağa tapşırmaq** *tənt.* – b a x **torpaq**. **Can (canını) tapşırmaq** – b a x **can**.

**TAR**[1] *is.* Azərbaycan və İranda çox yayılmış mizrabla çalınan simli musiqi aləti. *Tar çalmaq. Tar Azərbaycanın milli musiqi alətidir.*

**TAR**[2] *sif.* [*fars.*] *klas.* Qara. *Könlümü qarət edir öylə ki, tari-zülfün; Rumə sanki həbəşi ləşkəri-yağma gətirir.* X.Natəvan. // Tutqun, donuq, aydın görünməyən. *Tar şüşə. – Bu gün mənim gözümə afitab tar* (z.) *gəlir*. S.Ə.Şirvani. □ **Tar olmaq** – qaranlıq çökmək, qaranlıqlaşmaq. *Dağlar başı qar oldu; Bulud gəldi, tar oldu.* (Bayatı).

**TAR**[3] *is.* Ev quşlarının üstündə durub gecələməsi üçün hinə qoyulan ağac. *Bir qış axşamıydı, qapıda soyuq; Qalxdı tar üstünə bizim çil toyuq*. S.Vurğun. *Tardakı xoruz qanadlarını şappıldadıb banladı*. S.Rəhimov.

◊ **Toyuq tara çıxanda (çıxan vaxt)** – b a x **toyuq**. **Toyuq tardan düşəndə (düşən vaxt)** – b a x **toyuq**.

**TAR**[4] *is.* Üst-üstə dərəyə yağıb yığılmış qalın qar yığını. *Tara düşmək. Tara batmaq. – Dağ başında çar qala; Duman keçə, tar qala; Bir arzum var ürəkdə; Mən ölsəm də yar qala*. (Bayatı). [Bəylər] *tarın yanına gəlib gördülər ki, Nəbigil tüfənglən ayaqyolu açıb addamışlar o tərəfə.* "Qaçaq Nəbi". □ **Tar bağlamaq** – yağıb bir yerə yığılmaq, təpə əmələ gətirmək (qar haqqında). *Elə ki əsnədi çovğunla külək; Çöldə tar bağlayıb qar çıxdı dizə.* S.Vurğun.

**TARAC** *is.* [*fars.*] Qarət, çapovul, talan; talama. □ **Tarac etmək** – 1) talan etmək, qarət etmək, çapıb talamaq. *Külli-varin etdilər tarac, yağma, tarümar*. M.V.Vidadi; 2) məhv etmək, dağıtmaq, yox etmək, puç etmək, puça çıxarmaq. *Pulunu tarac etmək.* **Tarac olmaq** – 1) talan olmaq; 2) məhv olmaq, dağılmaq, yox olmaq, puç olmaq. [Nurəddin ağa:] *Mədrəsə yerinə, azarxana yerinə, bax gör, hansı yolda tarac olur sərmayə.* N.Vəzirov. *Bəylərin, xanların – qansoranların; Taxtı tarac oldu tamam onların!* S.Vurğun.

**TARAKAN** *is.* [*rus.*] Mətbəxböcəyi, mətbəxqurdu.

**TARAQQA** *is.* İçi barıtla doldurulmuş kağızdan düzələn partlayıcı fişəng (atəşbazlıqda əyləncə üçün işlənir).

**TARAQ-TARAQ, TARAQ-TURUQ** *is.* Təkrar edən, davamlı taqqıltı səsi. *Mədəniyyət evinin yeni binasında taraq-turuq səsindən qulaq çatlayırdı.* M.İbrahimov. *Hey atılır güllələr; Atılır taraq-taraq*. B.Vahabzadə.

**TARÁN** [*rus.*, əsli. *yun.*] *hərb.* 1. Öz təyyarəsini, gəmisini, ya tankını düşmən təyyarəsinə, gəmisinə, ya tankına zərblə vurmaqdan ibarət döyüş üsulu. *Birdən gur səs ilə deyir ucadan: – Güllləm yoxsa əgər, üsul var! Taran!* M.Rahim.

2. Düşmənin cəbhəsini yarıb onun mövqelərinə soxulmaqdan ibarət döyüş əməliyyatı, həmçinin bu əməliyyatı həyata keçirən zərbə.

3. B a x **qoçbaşı**.

**TARANLAMAQ** *f. hərb*. 1. Öz təyyarəsinin, gəmisinin və ya tankının gövdəsi ilə düşmən təyyarəsinə, gəmisinə və ya tankına zərbə endirmək. *Düşmən təyyarəsini* (*tankını*) *taranlamaq*.

2. Taran (2-ci mənada) üsulu ilə düşmənin cəbhəsini yarmaq. *Cəbhəni taranlamaq*.

**TARANTELLA** *is.* [*ital.*] Coşqun xarakterli italyan xalq rəqsi.

**TARAŞ** *is.* [*fars.*] 1. Qırxma. □ **Taraş etdirmək** – qırxdırmaq. *Başını taraş etdirmək.* **Taraş etmək** – qırxmaq. *Üzünü taraş etmək.*

2. *köhn.* Üzdən, üstündən səthi surətdə yonma. □ **Taraş etmək** – üzdən yonmaq. *Karandaşları taraş etmək.* // Bu iş üçün alət, yonma qələmi.

**TARAŞLAMA** "Taraşlamaq"dan *f.is.*

**TARAŞLAMAQ** *f.* Taraş etmək, qırxmaq. *Saqqalını taraşlamaq.*

**TARAŞLI** *sif.* Taraşlanmış, taraşla yonulmuş. □ **Taraşlı stəkan** – tin-tin stəkan.

**TARAZ** [*fars.*] 1. *sif.* və *zərf* Düz, dümdüz, bərabər, eyni bərabərdə, eyni vəzndə. *Boş tərəzinin gözləri bir-birilə taraz gəlmədi.* [Kosa] *daş götürdü, pərsəng atdı, qıraqları çürümüş çanaqları birtəhər düzəlişdirdi.* S.Rəhimov. □ **Taraz olmaq** – bərabər olmaq, bərabərləşmək. *O gün ki fəsli-yaz olur; Gecə, gündüz taraz olur.* A.Səhhət.

2. *is. xüs.* Dülgərlikdə, torpaq və bənnalıq işlərində səthin düzlüyünü yoxlamaq üçün alət. *..Fəhlələr yer qazar, evin binəsini qoyar, usta taraz ilə ölçər, .. başlayıb divarı qaldırardı.* Mir Cəlal.

**TARAZI** [*fars.* tərazu] b a x **tərəzi**.

**TARAZLAMA** "Tarazlamaq"dan *f.is.*

**TARAZLAMAQ** *f.* Düzləmək, taraz etmək, bərabərləşdirmək. *Tərəzinin gözlərini tarazlamaq. – ..Kamil özünü qabağa atıb sükanı burdu, pozulmuş müvazinəti tarazladı və qayığı batmaqdan qurtardı.* M.Süleymanov.

**TARAZLANMA** "Tarazlanmaq"dan *f.is.*

**TARAZLANMAQ** *qayıd.* Düzlənmək, bir-birinə taraz olmaq.

**TARAZLAŞDIRILMA** "Tarazlaşdırılmaq"-dan *f.is.*

**TARAZLAŞDIRILMAQ** *məch.* Taraz edilmək, müvazinətləşdirilmək.

**TARAZLAŞDIRMA** "Tarazlaşdırmaq"-dan *f.is.*

**TARAZLAŞDIRMAQ** *f.* Düzləşdirmək, müvazinətləşdirmək, uyğunlaşdırmaq. *Hər anda inersiya qüvvəsi ilə nöqtəyə təsir edən qüvvələr və reaksiya qüvvələri bir-birini tarazlaşdırır.* Z.Xəlilov.

**TARAZLAŞMA** "Tarazlaşmaq"dan *f.is.*

**TARAZLAŞMAQ** *qarş.* Düzləşmək, taraz olmaq, bərabərləşmək, müvazinəti bir-biri ilə uyğunlaşmaq. *Mənfi balansda bədənin qida maddələri dağılır, maddələr tarazlaşanda isə onların gəliri çıxarına bərabər olur.* "Ümumi zootexniya".

**TARAZLIQ** *is.* 1. Üfüqi cəhətdən düzlük. *Divarın tarazlığını yoxlamaq.*

2. İki şeyin bir-biri ilə uyğunluğu, eyni ağırlıqda, vəzndə olması; müvazinət. *Tərəzi gözlərinin tarazlığı.*

**TARÇALAN, TARÇI** *is.* Tarda çalan çalğıçı; tarzən. *Ey tarçı, çal, oxu! Könlümü al, oxu!* M.Müşfiq. *Qurban təzə-təzə əlinə tar almağa başladığı zamanlar Qarabağda tarçalan Sadıq yaşayırdı.* İ.Əfəndiyev.

**TARÇILIQ** *is.* Tar çalma sənəti, tarçı peşəsi.

**TARIM** *zərf* Tarımlanmış, bərk dartılıb çəkilmiş halda olan (adətən "çəkmək", "çəkilmək" feilləri ilə işlənir). *İpi* (*məftili*) *tarım çəkmək. – Kotan yerə işlədikcə zəncir tarım çəkilir, öküzlər yamac yuxarı .. sürünürdü.* B.Bayramov.

**TARIMLAMA** "Tarımlamaq"dan *f.is.*

**TARIMLAMAQ** *f.* Tarım çəkmək, bərk dartıb çəkmək, tarım etmək. *İpi* (*burazı*) *tarımlamaq.*

**TARIMLIQ** *is.* Tarım çəkilmiş ipin, zəncirin və s.-nin halı.

**TARİ́F** [*fr.*] Rəsmən müəyyən edilmiş ödünc, vergi, rüsum, maaş və s. miqdarı (cədvəli). *Gömrükxana tarifi. Əmək haqqı tarifi. Poçt tarifi.*

**TARİFLƏŞDİRİLMƏ** "Tarifləşdirilmək"-dən *f.is.*

**TARİFLƏŞDİRİLMƏK** *məch.* Tarifləşdirmə aparılmaq.

**TARİFLƏŞDİRMƏ** "Tarifləşdirmək"dən *f.is. Tarifləşdirmə komissiyası.*

**TARİFLƏŞDİRMƏK** *f.* Vergi və ya ödünc obyektlərinin təsnifi əsasında tarif təyin etmək, tarifləşdirmə aparmaq. *Müxtəlif işləri tarifləşdirmək.*

**TARİX** *is.* [*ər.*] 1. Bir hadisənin baş verdiyi, cərəyan etdiyi vaxt; keçmiş həyata aid olub adamların hafizəsində qalmış fakt və hadisələrin məcmusu. *Tarixin təcrübəsi göstərir ki... Məsələnin tarixi. –* [Nüşabə:] *Şanlı tariximiz görməmiş ləkə; Zəfərlər qazanmış bu şanlı ölkə*! A.Şaiq.

2. İnkişaf prosesindəki gerçəklik. *Tarixin qanunları. Tarixin dialektikası. Tarixin gedişi.*

3. İnsan cəmiyyətinin inkişafı haqqında elm. *Azərbaycan tarixi. Orta əsrlər tarixi*. – *Tarix insan cəmiyyətinin həyatı haqqında elmdir*. "Qədim dünya tarixi". // Həmin fənnə aid kitab, dərslik, dərs. *Tarixdən* "*5*" *almaq. Tarix kitabı*.

4. Bir şəxs və ya şeylə bağlı olan fakt və hadisələrin tarixcə məcmusu. *Sumqayıt şəhərinin tarixi. Onun başına gələn hadisələrin tarixini heç kəs bilmir*. – [Qaraş:] *Yaxşı, Qızyetərin tarixini danışma, sözünü de*. M.İbrahimov.

5. Bir hadisənin, şeyin inkişafının gedişi, ardıcıl inkişafı. *Yer qabığının təşəkkül tarixi. Hadisələrin inkişaf tarixi*.

6. Təbiətin, mədəniyyətin, elmin hər hansı bir sahəsinin ardıcıl inkişaf və dəyişməsini öyrənən elm. *Musiqi tarixi. Ədəbiyyat tarixi*. – *Cəlil Məmmədquluzadə* (*Molla Nəsrəddin*) *Azərbaycan mədəniyyəti və maarifi tarixində tamamilə yeni və parlaq bir dövr açdı*. M.İbrahimov.

7. Əhvalat, hekayə, rəvayət. *Tarix uzundur... Tarixi gözdən keçirmək*.

8. Keçmiş. [Xristofor:] *Bu şux zahirin də faciəli bir tarixi var*. Çəmənzəminli.

9. Bir hadisənin dəqiq təqvim vaxtı. *Doğum tarixi*. // Sənəddə, məktubda və s.-də onun yazılması vaxtı haqqında qeyd (il, ay, gün). *Teleqramın tarixi. Əmrin tarixi. Təliqəyə tarix qoymaq*.

◊ **Tarix boyu** – bütün tarix ərzində, bütün dövrlərdə, lap əvvəldən bu günə kimi. *Bu qurultay tarix boyu görünməmiş nəhəng bir sıçrayış dövrünün başlandığını xəbər verəcək*. M.Hüseyn. **Tarixdə görünməmiş** – heç vaxt olmamış, bu vaxta qədər misli görünməmiş hadisə haqqında. **Tarixdən əvvəl (qabaq)** – miladi tarixindən əvvəl (qabaq). *Rüstəm kişi Mayanın sözünü kəsdi: – Tarixdən üç yüz il əvvəl deyirsən, onda neçə il elər?* M.İbrahimov. **Tarixdən əvvəlki (qabaqkı)** – 1) miladi tarixindən əvvəlki (qabaqkı); 2) qədim dövrlərə aid olan, yazılı sənəd olmayan. *Tarixdən əvvəlki dövrlər*. **Tarixə (tarixdə) yazılmaq** – heç vaxt unudulmamaq, həmişə yadda qalmaq. [Koroğlu:] *Mən gərək o Rum paşasına bir divan tutam ki, tarixlərdə yazıla*. "Koroğlu". **Tarixin təkərini geri döndərməyə çalışmaq** – tarixin qanunauyğun inkişafının qarşısını almağa, geri qayıtmağa çalışmaq. **Canlı tarix** – b a x **canlı**. **Xəstəlik tarixi** – b a x **xəstəlik**.

**TARİXÇƏ** b a x **tarix** 4-cü mənada. *Teymurun İsmayılzadələrlə dostluğunun tarixçəsini yaxşı bilən İmanov zarafat tərzində Qüdrətə dedi*.. M.Hüseyn. *Kənddə olmuş hər bir hadisənin, salınan hər bağın, əkilən hər ağacın, tikilən hər evin tarixçəsini* [Xoşqədəm nənədən] *soruşardılar*. S.Qədirzadə.

**TARİXÇİ** *is*. Tarix mütəxəssisi; tarix elmi ilə məşğul olan alim; tarixşünas.

**TARİXƏN** *sif*. [*ər*.] Tarixə görə, tarix etibarilə, tarix baxımından. *Tarixən düzgün qiymətləndirmək. Tarixən doğru deyil*.

**TARİXİ** *sif*. [*ər*.] 1. Həqiqətən olmuş, həqiqətə uyğun olan, uydurma olmayan. *Tarixi fakt. Tarixi şəxsiyyət. Tarixi şərait*.

2. Tarix üçün əhəmiyyəti olan, tarixə daxil olmuş; əhəmiyyətli, əlamətdar. *Tarixi qurultay*. – *Bakı ən mühüm, ən tarixi günlər keçirirdi*. M.S.Ordubadi.

3. Tarixdə olmuş hadisəyə əsaslanan, tarix əsasında qurulmuş, tarixdən götürülmüş. *Tarixi roman. Tarixi dram*.

4. Hadisələrə, onların törəmə və inkişafı baxımından yanaşan, baxan, tədqiq edən. *Müasir dil faktlarının tarixi izahı. Hadisələrə tarixi baxış*. // Hadisələri, ardıcıl inkişafı baxımından tədqiq edən, öyrənən. *Tarixi coğrafiya. Tarixi qrammatika*.

5. Cəmiyyətin inkişafının müəyyən mərhələsi ilə bağlı olan; daimi olmayan, keçici. *Tarixi kateqoriya*.

6. Tarixdən əvvəlki dövrlərə deyil, maddi abidələrin qaldığı dövrə aid olan. *Xalqın həyatının tarixi dövrü*.

◊ **Tarixi materializm** – b a x materializm.

**TARİXİ-HİCRİ** *is*. [*ər*.] Hicri tarix (Məhəmmədin Məkkədən Mədinəyə köçdüyü vaxtdan hesablanan müsəlman təqvimi).

**TARİXİLİK** *is*. 1. Hər hansı bir şey və ya hadisənin törəməsinin və inkişafının, onu doğuran konkret tarixi şəraitlə bağlı olaraq öyrənilməsi, hadisələrə tarixi yanaşma prinsipi.

2. Tarixi faktlarla uyğunluq, tarixən dəqiq və düz olma. *Tarixi romanda tarixilik prinsipinə riayət etmək əsas şərtdir*.

**TARİXİ-MİLADİ** *is.* [*ər.*] Miladi tarix (İsanın anadan olduğu gündən hesablanan təqvim).

**TARİXLİ** *sif.* Tarixi yazılmış, yazıldığı vaxt qeyd olunmuş, göstərilmiş. *1977-ci il 15 may tarixli məktub. 2 avqust tarixli "Molla Nəsrəddin" jurnalı.*

**TARİXNƏVİS** [*ər.* tarix və *fars.* ...nəvis] *köhn.* bax **tarixyazan**. [Şah Abbas:] *Fərraş göndər, Sərdar Zaman xanı, Mirzə Yəhyanı, Möhsün xanı, tarixnəvis İskəndər bəyi, Molla Səmədi hüzuruma çağır.* M.F.Axundzadə.

**TARİXSİZ** *sif.* Tarixi qoyulmamış, yazıldığı vaxt (il, ay, gün) göstərilməmiş. *Tarixsiz məktub. Tarixsiz sənəd.*

**TARİXŞÜNAS** [*ər.* tarix və *fars.* ...şünas] bax **tarixçi**.

**TARİXYAZAN** *is.* Şahidi olduğu hadisələri qələmə alan, ümumiyyətlə, hadisələri yazan şəxs; tarixçi, tarixnəvis.

**TARİK**[1] *is.* [*ər.*] *köhn.* Tərk edən, gedən, dünyadan əl üzən.

**TARİK**[2] *sif.* [*ər.*] 1. Qaranlıq.

2. Qara.

**TAR-QAVAL** *top.* Tar və qaval (və bəzən kamançadan) ibarət çalğı. *Bu zaman doğrudan da tar-qaval səsi gəldi.* M.Hüseyn.

**TARLA** *is.* Taxıl, pambıq, qarğıdalı və s. əkilmiş böyük sahə, əkin (yeri); zəmi. *Bu qız üç gün əvvəl atası ilə çəltik tarlasında çalışırdı.* Mir Cəlal. ☐ **Tarla düşərgəsi** – tarlada işləyənlərin istirahəti, yeyib-içməsi və s. məqsədlər üçün onun yanında düzəldilən tikili (talvar və s.). *Sədrlə katib başqa manqaların sahəsinə gedəndə qızlar tarla düşərgəsinə gəlib səhər yeməyi yeyirdilər.* Ə.Vəliyev.

**TARLAÇI** *is.* Tarlada işləyən kolxozçu və ya sovxoz fəhləsi. *Tarlaçıların yarışı.*

**TARLAÇILIQ** 1. *is.* Tarlaçının işi, tarlada işləmə.

2. *Sif. mənasında*. Tarlaçılardan təşkil olunmuş, tarlaçılardan ibarət olan. *Tarlaçılıq briqadası.*

**TARLAQORUYUCU** *sif.* Tarlanı küləyin təsirindən qorumaq üçün əkilən. *Tarlaqoruyucu meşə zolaqları.*

**TARLANMA** "Tarlanmaq"dan *f.is.*

**TARLANMAQ** *f.* 1. Qaralmaq, tutulmaq. *Hava tarlandı.*

2. Qırt yatmaq (toyuq).

**TARLAŞMA** "Tarlaşmaq"dan *f.is.*

**TARLAŞMAQ** *f.* Tar olmaq, alaqaranlıq olmaq, qaranlıq düşmək. *Hava tarlaşmışdı.*

**TARLIQ** *is.* Tar olma; alaqaranlıq, toranlıq, tar şeyin halı.

**TAR-MAR** *sif.* 1. Bir-birinə qarışmış, dolaşıq, nizamsız, qarışıq; pərişan. [Süleyman Əsgərə:] *Nədir sənin dərdin, bu nə ah-zardır; Nədir sənin fikrin belə tar-mardır.* Ü.Hacıbəyov. *Məzar... Şaxta kəsir, o tənha xəyal; Yönəlir yoluna fikri tar-mar.* M.Rahim.

2. Xaraba, dağınıq, dağılmış, viran qalmış. *Tar-mar ev.*

◊ **Tar-mar etmək** – 1) bir-birinə qarışdırmaq, dolaşdırmaq, nizamsız hala salmaq; 2) xaraba qoymaq, dağıtmaq, viranə qoymaq. [Hacı Murad:] *Məhərrəm bəy mənim atamın yurdunu tar-mar edər..* S.S.Axundov; 3) məhv etmək, yox etmək, dağıtmaq, darmadağın etmək. *Düşmənin səflərini eləyəndə tar-mar; Bilirlər ki, arxada neft dəryası Bakı var.* R.Rza. **Tar-mar olmaq** – 1) bir-birinə qarışmaq, nizamsız hala düşmək, dolaşmaq; 2) xaraba qalmaq, dağılmaq, alt-üst olmaq. [Məmməd:] *Padşah yıxıldı, gorbagor oldu; Uçdu sarayları, tar-mar oldu.* Z.Xəlil; 3) dağılmaq, məhv olmaq, darmadağın olmaq. *Hitler Almaniyası tar-mar oldu.* Ə.Sadıq.

**TARP** *təql.* Bərk, ağır bir şeyin birdən-birə yerə düşməsindən və ya ağır, bərk şeylərin bir-birinə toxunmasından çıxan səs. [Odabaşı:] *Hacı bunu eşidən tək tarp dəydi yerə.* Ə.Haqverdiyev.

**TARTAN-PARTAN** *is.* Boş, mənasız sözlər, danışıq; hədyan. *Tartan-partan* (z.) *danışmaq.*

**TARZƏN** [*fars.*] bax **tarçı**. *Tarzən ilə kamançaçı məharətlə çalır, qavalvuran oğlan isə boğazını arıtlayıb oxumağa hazırlaşırdı.* M.Hüseyn.

**TAS**[1] *is.* Enli, dairəvi, dayaz metal qab; teşt, ləyən. *Hamam tası. – Hənifə bir əlində tas, o biri əlində isti su ilə dolu vedrə .. tövşüyə-tövşüyə içəri girdi.* İ.Hüseynov.

2. Köhnə məişətdə: tas qurmaqla fala baxma, tas falı. [Sərvinaz xanım:] *Deyib, arxa-*

*yın ol, arvad, tas yaxşı göstərir.* N.Vəzirov. ☐ **Tas qurmaq** – köhnə məişətdə: içi su ilə dolu tası müşahidə etməklə fala baxmaq. *Nəhayət, uşaq üçün fala baxdırıb tas qurdurar və dua yazdırardılar.* H.Sarabski. *Falçı* [Sayalı arvadla] *tas qurardı.* Mir Cəlal.

◊ **Köhnə hamam, köhnə tas** – hər şey əvvəldə olduğu kimi, qətiyyən heç bir şey dəyişmədən (dəyişməmiş).

**TAS²** *is.* [*ər.*] Nərd oyununda üç, bəzən də dörd xal qazanıb oyunu udma və ya üç, bəzən də dörd xal itirib oyunu uduzma.

**TASA¹** *is.* [*fars.*] 1. Qəm, qüssə, kədər.

2. Çırpınmaq, narahatlıq, qərarsızlıq.

**TASA²** *is. məh.* Qəzəb, hirs.

**TASABAXAN** *is. köhn.* Tasla fala baxan adam; falçı (b a x **tas¹** 2-ci mənada).

**TASKABAB** *is.* Taskababıda bişirilən xırda küftə və ya doğranmış ət və kartofdan ibarət xörək.

**TASKABABI** *is.* Ağzı kip örtülən ikiqulplu qazança.

**TASKÜLAH** *is.* [*fars.*] *köhn.* Dəbilqə.

**TASKÜLAHLI** *sif. köhn.* Başında taskülah olan; dəbilqəli. *Ümumi sakit ikən etdi mətləbə ağaz; Dəmir geyimli, polad taskülahlı bir knyaz.* A.Səhhət.

**TASLAQ** *is.* Bir şeyin hələ qəti bir şəkil almamış halı; eskiz, sxem.

**TAT** *is.* Azərbaycan, Dağıstan və İranda yaşayan irandilli xalq və bu xalqa mənsub adam.

**TATAR** *is.* 1. Tatarıstanın əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

2. Volqaboyunda, Sibirdə və s.-də yaşayan türkdilli bəzi kiçik xalqların adı.

3. XIII-XV əsrlərdə Qızıl Orda dövlətini təşkil edən müxtəlif türk, monqol və b. tayfaların adı.

**TATARCA** *sif.* və *zərf* Tatar dilində. *Tatarca öyrənmək. Tatarcadan tərcümə.*

**TATARÍ** *is.* Qırmanc, qamçı. *Çiynində tüfəngi, döşdə qatarı; Belində xəncəri, əldə tatarı.* H.K.Sanılı.

**TATARILAMA** "Tatarılamaq"dan *f.is.*

**TATARILAMAQ** *f.* Tatarı ilə vurmaq; qırmanclamaq, qamçılamaq.

**TAUN** *is.* [*ər.*] 1. Qusma və ishal şəklində təzahür edən çox yoluxucu ağır epidemik xəstəlik.

2. Qarğış məqamında işlənir. *Səni taun tutsun!*

**TAU-SAQQIZ** *is. bot.* Dağlarda bitən çoxillik kauçuklu ot-bitki. *Tau-saqqız .. çoxillik, yoğun, kobud kökləri olan və kök bicləri verən bitkidir.* M.Qasımov.

**TAVA¹** *is.* İçində ət və s. qızartmaq üçün kənarları yastı, dairəvi metal qab. *Mis tava. Tavada ət qızartmaq.* – [Sayad] *tez dönüb, qara tavanı yerə qoydu.* M.Hüseyn. *Pərşan ocağı alışdırdı, tavaya yağ atdı.* M.İbrahimov.

**TAVA²** b a x **tavadaşı**.

**TAVADAŞI** *is.* İri, əsasən yastı daş; tava. *Hamamın yeri təmiz yonulmuş ağ tavadaşılarla döşənmiş olardı.* H.Sarabski.

**TAVAKABABI** *is.* Ayrıca tavada bişirilən kiçik küftə və yumurtadan ibarət xörək. *Uşaqlar Fatma xalanın onlar üçün hazırladığı ağ, təmiz bağlamanı açıb, çörək arasındakı tavakababılarını böyük iştaha ilə yedilər..* H.Seyidbəyli.

**TAVALIQ** *is.* Qayalıq, daşlıq. *Tavalıqda xırman sürmək.*

**TAVAN¹** *is.* Binanın daxilinin üst örtüsü; səqf. *Bir qoca da zilləyərək gözlərini tavana; Ovuşdurub ovucunda tütün tökür qəlyana.* S.Rüstəm. *Alçacıq tavandan torpaq tökülür; Lakin üzlər gülür, baxışlar gülür.* Ə.Cəmil.

◊ **Tavan altda (altında) qalan deyil** – borcundan çıxar, əvəzini verər, xəcalətindən çıxar. *..Özün bilirsən ki, mən tavan altda qalan oğlan deyiləm, arxayın ol, xəcalətindən çıxaram.* "Kirpi".

**TAVAN²** *is.* [*fars.*] Güc, qüvvət, qüvvə (çox vaxt "tab" sözü ilə bərabər işlənir). *Dedim, ayrılığa yoxdur tavanım; Ayrılıb getməsin sərvi-rəvanım.* Ə.Cavad.

**TAVANA** *is.* [*fars.*] 1. Maddi imkan, pul, var, dövlət. *Ev boş, ev soyuq; Bircə şam almağa tavanası yox.* B.Vahabzadə.

2. B a x **tavan²**. *Əlinin tavanası yoxdur.*

**TAVANALI** *sif.* Maddi imkanı olan, varı, pulu, dövləti olan; pullu, dövlətli, varlı. [Qorxmaz:] *Mən bu fikirdəyəm ki, biz daha iri, tavanalı və güclü bir kolxozda birləşməliyik.* Ə.Vəliyev.

**TAVANASIZ** *sif.* Maddi imkanı olmayan, pulu olmayan; kasıb.

**TAVANLI** b a x **tavanalı**. *Naməlsəm məhəlləsinin camaatı ata-babadan yerli, tavanlı olub, günlərini müttəsil eyş və işrətdə keçirən bir xalq idi.* N.Nərimanov.

**TAVAR[1]** *is.* Balaq (camış balası).

**TAVAR[2]** *sif. məh.* İri, böyük, yekə.

**TAVAR[3]** *sif. məh.* Çalışqan, bacarıqlı, zirək.

**TAVOT** *is.* Sürtkü yağlarının bir növü.

**TAVR** *is.* Krımın cənub hissəsinin qədim əhalisi.

**TAVTOLÓGİYA** [*yun.* tauto – o özü və logos – söz] Əvvəl deyilən şeyin başqa şəkildə və ya başqa söz və ya ifadə ilə təkrarı.

**TAY[1]** *is.* Bab, bərabər, münasib, misl. [Züleyxa xanım:] *..Altmış yaşında qoca ona taydı?* N.Vəzirov. *Xasay bir oğlandır, ona tay hanı? Var adı, qulluğu, şöhrəti, şanı.* S.Vurğun. □ **Tay etmək** – bərabər tutmaq; bir tutmaq. *Mələkdən də səni billəm ziyadə; Tay etmərəm heç insanı mən sənə.* M.P.Vaqif. *Mənim qızımı bir qaraçı qızına taymı edirsən, – deyə Hüseynqulu ağa bağırdı*. S.S.Axundov. **Tay olmaq** – bab olmaq, bərabər olmaq. [Ahıl qadın:] *İndi biz gəlib Cahan xalaya tay ola bilmərik*. Ə.Haqverdiyev. *Cuma... özünə tay olacaq bir əsgər .. gözaltı etməyə çalışacaqdı.* Ə.Əbülhəsən. **Tayını tapmaq** – hər cəhətdən özünə uyğun, özünə bab, özünə münasib adam tapmaq, yoldaş tapmaq. *Tərlan idin, öz tayını tapmadın; Getdi, qismət oldu sarə zülflərin.* Aşıq Ələsgər. **Tay tutmaq (qoymaq)** – b a x **tay etmək**. *Dağarcığını çuvala tay tutur*. (Ata. sözü). [Hafizə xanım:] *Bəxtəvər başıma, gör məni aparıb kimə tay qoydu.* Ə.Haqverdiyev.

**TAY[2]** *is.* 1. Tək, bir. *Öküzün taydı, işin aydı*. (Ata. sözü).

2. Ümumiyyətlə, qoşa şeylərdən hər biri. *Qırılmış cilovun, taydır üzəngin*. M.Rahim. // Eyni mənada ayaqqabı, corab, əlcək və s. haqqında. *Əlcəyin tayı. Corabın bir tayı cırılıb.* – [Sona xanım:] *..Başmağımın tayı ayağımdan sürüşüb çıxdı, qaranlıqda axtarıram, tapmıram.* M.F.Axundzadə. // Eyni mənada qapı, pəncərə haqqında; lay. *Yunis qapının bir tayını açanda iri bir şəkil gözünə sataşdı.* Mir Cəlal.

**tay-tay** b a x **taybatay**. *Geniş pəncərələr açılar tay-tay*. S.Vurğun.

**TAY[3]** *is.* 1. Kisəyə, yeşiyə və s.-yə qablaşdırılmış yük. *Hər birinə ağır taylar çatdılar*. Q.Zakir. *..Gah da Aşqabadda Hacı Zeynalabdın Tağıyevin doqquz tay manufaktur malını oğurlayırlar.* C.Məmmədquluzadə.

2. B a x **taya**. *Küləş tayı.*

**tay-tay** *sif.* Taylarla, çox, çoxlu, kisələrlə, yeşiklərlə, top-top. *İndi top-top, tay-tay parça, kisə-kisə şəkər, un, düyü daşınırdı.* Ə.Əbülhəsən.

**TAY[4]** *is.* Bir yeri iki hissəyə bölən şeyin tərəflərindən biri. *Divarın bu tayı. – Pərdənin o tayında da sükut vardı.* S.Rəhman. // Eyni mənada dağ, dərə və s. haqqında. *Rübabə dərənin o tayında, lap aşağıda qarda yüyürən bir adam gördü*. Mir Cəlal. *Azərbaycan cənubda – Xəzər sahilində, Qafqaz sıra dağlarının o tayında gözəl bir ölkədir.* Ə.Məmmədxanlı. // Eyni mənada çay, göl, dəniz və s. haqqında; sahil, tərəf, yan. *..Girdiman torpağının sərhədi Kür çayının o tayından başlanır*. M.Hüseyn. *Çayın o tayındakı yoncalıqlarda çoxlu kəpənək və çəyirtkə vardı.* Ə.Vəliyev.

**TAY[5]** "Ta" (4-cü mənada) sözünün danışıq dilində işlənən forması. *Hökumət adamları Nəbinin dalıncan tay kəndə gəlmirdilər.* "Qaçaq Nəbi". [Süleyman:] *Naharı elədik, tay nə oturaq, dur gedək bağa*. Ə.Haqverdiyev.

**TAYA** *is.* Üst-üstə yığılmış ot, taxıl, saman, odun və s. qalağı (yığını). *Taxıl tayası. Küləş tayası. – Bir tərəfdən tayanın dibində su bardağı, çörək düyünçəsi, əyin paltarı və bir neçə boş çuval*. C.Məmmədquluzadə. *Evin yanında bir taya təndir odunu var idi*. B.Talıblı. □ **Taya basmaq (vurmaq)** – taxılı, odunu və s.-ni bir yerə toplayıb taya düzəltmək. *Pambıqdan taya vurmaq. – Məşədi İslam taya basırdı.* Mir Cəlal. **Bir taya** – çox, çoxlu. *Bir taya çirk paltar*.

**TAYACIQ** *is.* Kiçik taya, balaca taya. *Ot tayacığı. Saman tayacığı.*

**TAYALAMA** "Tayalamaq"dan *f.is.*

**TAYALAMAQ** *f.* Otu, küləşi, pambığı, taxılı və s.-ni saxlamaq üçün bir yerə toplayıb taya düzəltmək, taya vurmaq. *Pambığı taya-*

*lamaq*. – [Arvadlar] *..çoxdan quruyub qotmanlarda qalan otu tayalayırdılar*. Ə.Əbülhəsən. [Sadıq:] *Yəqin İskəndər bu saat Həsən kişinin qapısında ot tayalayır*. Ə.Haqverdiyev.

**TAYALATMA** "Tayalatmaq"dan *f.is.*

**TAYALATMAQ** *icb.* Ot, küləş, taxıl, pambıq və s.-ni saxlamaq üçün toplayıb taya düzəltdirmək, taya vurdurmaq. *Qurumuş otu tayalatmaq. Pambığı tayalatmaq*.

**TAYAVURAN** *is.* Ot, taxıl, pambıq və s.-dən taya düzəldən maşın və s. // Sif. mənasında. *Tayavuran maşın.*

**TAYAYAQ(LI)** b a x **tayqılça(lı)**. *Tayayaq qoca.*

**TAYBATAY** *zərf* Hər iki tayı tamamilə açıq halda. *Pəncərə taybatay açıqdır. – Mən özümü eşitməməzliyə qoyub, qapını taybatay açdım.* Qantəmir. *Çox çəkmədi ki, darvaza cırıltı ilə taybatay açıldı*. Q.İlkin.

**TAY-BƏRABƏR** b a x **bərabər** 4-cü mənada. *Bütün dağlılar arasında İskəndər bəyin adı söylənirdi. İgidlikdə, at çapmaqda, düşmən bağrı yarmaqda tay-bərabəri yox idi*. Ə.Haqverdiyev. *Ürəyini boşaldıb, baxdı ata oğluna; Tay-bərabər görmədi bu dünyada oğluna*. S.Rüstəm.

**TAYBUYNUZ(LU)** b a x **birbuynuzlu**[1]. *Taybuynuz öküzün halı belədir ki, onun buynuzunun biri yoxdur və belə olan surətdə o yazıq, necə ki lazımdır, özünü xata və bəladan mühafizə edə bilmir*. F.Köçərli.

**TAYDƏYİŞİK** *sif.* Cüt olmayan, komplekt olmayan, dəyişik salınmış. *Taydəyişik tufli*. ☐ **Taydəyişik düşmək** – bütövlüyü, tamlığı, komplektliliyi pozulmaq, birinin yerinə başqası düşmək, yerləri səhv düşmək. *Ayaqqabılar taydəyişik düşüb*. **Taydəyişik geymək** – sağ ayaq (əl) üçün olan ayaqqabını (əlcəyi) səhvən sol və ya əksinə, sol ayaq (əl) üçün olan ayaqqabını (əlcəyi) sağ ayağa (ələ) geymək. *Ayaqqabını taydəyişik geymək. – Köynəyini tərs geyirsən; Çəkmələri taydəyişik; Addımını atdıqca sən; İşıqlanır bu ev-eşik*. Ə.Kürçaylı. **Taydəyişik salmaq** – 1) b a x **taydəyişik geymək**. *Ayaqqabılarını taydəyişik salmaq;* 2) səhvən birisini, ya bir şeyi başqası ilə qarışdırmaq, çaşdırmaq. [Hüseyn:] *Mirmahmud, deyəsən, axı bunlar bizi taydəyişik salıblar..* S.Rəhman.

**TAYFA** *is.* [*ər.* taifə] 1. Sinifli cəmiyyətdən əvvəlki dövrdə adamların qohumluq münasibətinə, dil və ərazi ümumiliyinə əsaslanan birliyi; qövm. *Köçəri tayfalar.*

2. *dan.* Xalq, millət mənasında.

3. *dan.* Qohum, qəbilə, qohum-əqrəba. *Müəllim yaxşı bilirdi ki, Qəhrəmangilin bütün tayfasında bir nəfər də olsa savadlı adam yoxdur.* S.Rəhimov. *Şirzad kişi tayfasını Pərşanın hücumlarından qorumaq təşəbbüsünün nahaq olduğunu düşünüb dinmədi.* M.İbrahimov.

4. *dan. zar*. Ümumi bir xüsusiyyəti (əsasən ixtisası, sənəti, zehniyyəti) ilə birləşən adamlar dəstəsi, qrupu. [Bəylərdən birisi:] *..Həkim taifəsinin ehtiramı vacibdir, xalqın vecinə gəlirlər*. M.F.Axundzadə. [Sultan bəy Süleymana:] *Orasını doğru deyirsən, həqiqət tacir tayfası mənim xoşuma gəlir*. Ü.Hacıbəyov. [Muxtar Firəngizə:] *Şofer tayfası elə şeydir ki, üz versən astarını ikiqat istər*. B.Bayramov.

**TAYGÖZ(LÜ)** 1. B a x **birgözlü** 1-ci mənada. [Xan] *qəbul otağına keçəndə taygöz yasavulbaşını qapıda gördü.* M.Rzaquluzadə.

2. *sif.* Bir gözünün şüşəsi olmayan və ya sınıq olan (eynək, binokl və s. haqqında). *Sarxan əlindəki taygözlü durbini yanına salıb, uzandığı səngərdə dizi üstə qalxdı.* M.Hüseyn. *Zülfüqar deyinə-deyinə taygöz çeşməyi burnunun üstünə qoyub, sədrin yanına qaçdı*. B.Bayramov.

**TAYKEŞ** b a x **taydəyişik**. [Uşaqlar:] *Molla əmi, başmağın niyə taykeşdir?* Mir Cəlal.

**TAYQÁ** [*yakutcadan*] Avropa, Asiya və Amerikanın şimalında çətin keçilən iynəyarpaqlı meşələr zonası.

**TAYQILÇA(LI), TAYQIÇ(LI)** *sif.* Bir qıçı olmayan, bir qıçı kəsik; birqıçlı. *Bu ortaboylu, tayqıç, çalsaqqal kişinin qəribə tərcümeyihalı vardı.* S.Vəliyev. [Adil:] *Atam cəbhədən tayqılça* (z.), *qolunun biri də girdən düşmüş halda qayıtdı*. B.Bayramov.

**TAYQOL(LU)** b a x **birəlli**[1] 1-ci mənada. *Tayqollu muzdur imperialları sanayıb gördü ki, iki yüz imperialdır*. S.M.Qənizadə.

**TAYQULAQ(LI)** *sif.* Bir qulağı olmayan, bir qulağı kəsik. *Tayqulaq Kəblə Novruza rast gəldim*. M.S.Ordubadi.

**TAYQULP** *is.* Birqulplu kiçik qazan, tava, suqabı və s. [Mürsəl:] ..[Anam] *yumurta bişirmək üçün aldığım təzə tayqulpa qıymır.* Mir Cəlal.

**TAYLAŞDIRMA** "Taylaşdırmaq"dan *f.is.*

**TAYLAŞDIRMAQ** *f.* 1. Bir-birinə oxşayan, bir-birinə uyğun gələn şeyləri qruplaşdırmaq.

2. *bayt.* Müxtəlif xüsusiyyətlərinə görə uyğun gələn erkək və dişi heyvanları seçib cütləşdirmək.

**TAYLAŞMA** "Taylaşmaq"dan *f.is.*

**TAYLAŞMAQ** *f.* Tay olmaq, bərabər olmaq, bərabərləşmək; uyğunlaşmaq.

**TAYTAQ** *sif.* və *is.* Axsaq, çolaq.

**TAYTAQLIQ** *is.* Axsaqlıq, çolaqlıq.

**TAYTIMA** "Taytımaq"dan *f.is.*

**TAYTIMAQ** *f.* Axsamaq.

**TAY-TUŞ** *top.* Həmyaş və ya hər cəhətdən bir-birinə uyğun olan adamlar, yaxın yoldaşlar, yaşıdlar. [Şahbaz bəy:] *Mənim tay-tuşlarım tamam mərifət sahibi olub, qulluq edib, hörmət, izzət tapıb xoşbəxt olublar.* M.F.Axundzadə. *Şahmar nənəsini tək qoyub, hara gedə bilərdi? El-oba, tay-tuş ona nə deyərdi?* B.Bayramov.

**TAZI** *is.* Bərkqaçan, uzunqıçlı, arıq, qıvraq ov iti cinsi. *Dovşana qaç deyir, tazıya tut.* (Ata. sözü). *Ovçular qızılquş, tazı, tula götürüb ova çıxırlar.* A.Şaiq.

**TAZİYANƏ** *is.* [*fars.*] *köhn.* 1. Qırmanc, qamçı. [Koroğlu] *Qırata bir taziyanə vurdu.* "Koroğlu".

2. *məc. ədəb.* Kiçik satirik şeir. *Sabirin taziyanələri.*

**TE** "T" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**TEÁTR** [*yun.* teatros] 1. İncəsənətin, aktyorların tamaşaçılar qarşısında göstərdikləri səhnə tamaşaları vasitəsilə həyatı bədii surətdə əks etdirən növü. *Azərbaycan teatrının tarixi. – Hüseynin indi yadına düşdü ki, Həbib bəy o zaman teatrdan danışmışdı.* S.Rəhman.

2. Səhnə tamaşaları göstərən və bunun üçün ixtiyarında hər cür lazımi imkanları (artist kollektivi, bina və s.) olan idarə, təşkilat, müəssisə. *Opera və balet teatrı. Musiqili teatr. Dram teatrı. Kukla teatrı.* – [Qoşqar:] *İndicə yolda teatrın direktorunu gördüm.* İ.Hüseynov.

3. Tamaşa göstərilən bina. [Nuriyyə:] *..Ayna zorla məni yedirir, hər gecə kinoya, teatra aparırdı.* İ.Əfəndiyev. // *dan.* Səhnə tamaşası; tamaşa. *Teatr göstərmək. Bu axşam klubda yaxşı teatr var.*

4. Bu və ya digər müəllifə, yaxud ədəbi məktəbə və s.-yə aid dram əsərlərinin məcmusu toplusu. *M.F.Axundzadə teatrı.*

5. *məc. dan.* Gülməli, masqaraya qoyulmalı, qeyri-ciddi hadisə, iş, adam və s. haqqında. *İclas deyildi, teatr idi. Onun işi lap teatrdır.*

**TEATRŞÜNAS** *is.* [*yun.* teatros və *fars.* ...şünas] Teatrşünaslıq mütəxəssisi.

**TEATRŞÜNASLIQ** *is.* Sənətşünaslığın, teatrın inkişafını, onun ictimai həyatda rol və əhəmiyyətini öyrənən sahəsi.

**TEFLON** *is.* ABŞ-da istehsal olunan sintetik materiallardan birinin ticarətdə işlədilən adı.

**TEXMÍNİMUM** [*yun.* techne və *lat.* minimum] Texniki minimum müəyyən ixtisas sahəsində çalışan fəhləyə lazım olan biliklərin məcmusu, həmçinin fəhlələrin istehsalatdan ayrılmadan müəssisədə aldıqları texniki təhsil. *Texminimum dərnəyi.*

**TÉXNİK** [*yun.* technike] 1. Texnikanın müəyyən sahəsində çalışan orta texniki təhsilli mütəxəssis. *Mühəndislər və texniklər. Mədən texniki. Texnik-elektrik.*

2. Texnika sahəsində işləyən adam.

◊ **Diş texniki** – diş protezi qayıran mütəxəssis.

**TÉXNİKA** [*yun.* technike – bacarıq, ustalıq] 1. İctimai istehsalda tətbiq edilən alət və vasitələrin məcmusu, habelə insanın onları öyrənmək, tətbiq etmək və təkmilləşdirmək sahəsindəki fəaliyyəti. *Elm və texnika. Texnikanın inkişafı. Elm və texnikanın nailiyyətləri. Qabaqcıl texnika.* // *top.* Maşınlar, mexaniki alətlər, qurğular. *Texnikanı qorumaq. Kənd təsərrüfatı texnikası. Texnikanı təmir etmək. Hərbi texnika.*

2. Hər hansı bir işdə, sənətdə istifadə olunan professional üsulların məcmusu. *Şahmat oyununun texnikası.*

◊ **Təhlükəsizlik texnikası** – iş şəraitinin təhlükəsizliyini təmin edən vasitələr və üsullar sistemi.

**TEXNİKİ́** *sif.* 1. Texnikaya aid olan, texnikadan istifadə ilə əlaqədar olan. *Texniki tərəqqi. Texniki gerilik. Texniki bilik. – Texniki elmlər fakültəsinin binasından çıxarkən bir dəstə tələbə qabağımızı kəsib, bizimlə söhbət etmək istədiyini bildirdi.* M.İbrahimov.

2. Maşın və mexanizmlərin işinə aid olan, bir şey istehsal etmək prosesi ilə bağlı olan. *Avtomobillərə texniki baxış.* // Hər hansı bir istehsalatın texnikasına xidmətlə bağlı olan. *Texniki xidmət. Texniki şura.*

3. Sənayedə istifadə və emal edilmək üçün olan. *Texniki bitkilər* (*qənd çuğunduru, pambıq, günəbaxan və s.*). *Texniki yağlar. Meyvənin texniki sortları.*

4. Bir işdə müxtəlif köməkçi işləri görən. *Səhnənin texniki işçiləri. – Bu zaman texniki katib yenə qapını açıb içəri baxdı.* Q.İlkin.

5. Texnika və ya elmin hər hansı sahəsinə aid xüsusi anlayışı ifadə edən (professional söz, ifadə haqqında). *Texniki terminlər. Texniki ifadə.*

◊ **Texniki redaktor** – kitab, jurnal, qəzet və s.-nin poliqrafik tərtibatını verən və ona rəhbərlik edən adam.

**TÉXNİKUM** [*yun.*] Orta ixtisas təhsili verən texniki və ya ümumiyyətlə, peşə məktəbi. *Tikinti texnikumu. Kənd təsərrüfatı texnikumu. Texnikuma daxil olmaq.*

**TEXNOLÓGİYA** [*yun.* techne və loqos – məfhum, elm] İstehsal proseslərini həyata keçirmək üsul və vasitələri haqqında biliklərin məcmusu, habelə bu üsulların özü.

**TEXNOLOJİ́** *sif.* [*yun.*] Texnologiyaya aid olan, texnologiya üsulları ilə əlaqədar olan. *Texnoloji institut. Texnoloji bilik. Texnoloji tələblər.*

**TEXNÓLOQ** [*yun.*] İstehsalın müəyyən sahəsinin texnologiya mütəxəssisi. *Mühəndis-texnoloq. Kimyaçı-texnoloq.*

**TEİZM** *is.* [*yun.*] Allahın fövqəltəbii vücud kimi varlığına, bütün maddi və mənəvi proseslərə onun zəka və iradəsinə təsir göstərməsini qəbul edən dini, fəlsəfi təlim.

**TEKSTOLOGİYA** *is.* [*lat.*] Filologiya və tarix elmlərinin mətnlərin tədqiqi və nəşri ilə məşğul olan sahəsi; mətnşünaslıq.

**TEKTONİ́K** *sif.* [*yun.*] *geol.* 1. Yer qabığının hərəkətinə və deformasiyasına aid olan, onun nəticəsi olan. *Tektonik zəlzələ. Tektonik dağlar.*

2. Yer qabığının quruluşu və inkişafına aid olan. *Tektonik xəritə. Tektonik dövr.*

**TEKTÓNİKA** [*yun.* tektonike – tikinti sənəti] Geologiyanın, yer qabığının quruluşunu, hərəkət və deformasiya qanunauyğunluqlarını öyrənən sahəsi.

**TEL**[1] *is.* 1. Saçın hər bir dənəsi. *Məryəm qara saçlarından üç tel ayırdı.* "Əsli və Kərəm". // Ümumiyyətlə, saç. *Telini daramaq. – Gülsəhər kəlağayını irəli çəkib, sağ əli ilə telini sığalladı, köksünü ötürdü.* Ə.Vəliyev. // Tük. *Koroğlu durnanın telindən bir dəstə kəsib, Eyvazın papağına sancdı.* "Koroğlu". *Əzəl başdan Bəsrə, Bağdad eliniz; Bəylər üçün ərməğandır teliniz.* M.V.Vidadi. // Alına tökülmüş qısa saç, zülf.

2. Sapa bənzəyən, sap kimi olan hər şey. *Rüstəm kişi .. tütünün ətrindən, saçaqlı tellərinin rəngindən xüsusi ləzzət alardı.* M.İbrahimov. // *məc.* Obrazlı təşbehlərdə işlədilir. *Toğrul otağı dolaşır və Hüsaməddinlə danışmaq istədiyi sözləri seçib fikrinin telinə düzürdü.* M.S.Ordubadi. *Mən sevirəm üzərində boy atdığım torpağı; Ürəyimin bir telidir hər otunun yarpağı.* Ə.Cəmil.

3. Tar, kamança və s. simi. *Sürtdü kamançaya ayı əllərin; Az qaldı ki, lap qopara tellərin.* A.Səhhət.

4. Məftil, naqil, sim. *Küləyin qüvvəsindən elektrik telləri vıyıldayır, sanki bir faciəni oxşayırdı.* T.Ş.Simurq. *Bu gün səhər çəkilib qurtarmış elektrik telləri Yenikəndi bəzəmişdi.* M.Hüseyn.

5. *məc.* Bağ, əlaqə, rabitə.

6. *məc.* "Ziya", "şüa" mənasında. *Öpsün torpağını səhər yelləri; Üstündə titrəsin günün telləri.* M.Müşfiq. *Günəş öz tellərini yayan kimi düzlərə; Gecə öz sirlərini danışdı gündüzlərə.* B.Vahabzadə.

**TEL**[2] *is. məh.* Düyü unu və şəkərdən bişirilən tel şəklində ağ və kövrək şirniyyat növü. [Novruz] *bayramında və oruc*(*luq*) *bayramında tel, paxlava, peşmək və s. həlviyyat xonçası üstə bir əlbəsəlik ipək parça labüd gedəcəkdir.* R.Əfəndiyev.

**TEL**[3] "Teleqram" sözünün qısaltması. [Hacı Salman:] *Hacı əmin sənə qurban, bu teli bir oxu.* N.Vəzirov. [Göyçək Ümidə:] [Çiçək]

*getdi ki, nazirliyə vurduğu telin cavabını soruşsun*. B.Bayramov.

**TELBASAN** *is.* Saçları başda düzgün saxlamaq üçün qadınların saçlarına sancdıqları əşya.

**tele**... [*yun.* tele – uzaq] Mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, "uzaq məsafələrə işləyən, verilən, göndərilən, uzaq məsafələrdən görülən, eşidilən, yazılan" mənasını ifadə edir; məs.: teleqram, teleskop, telefilm və s.

**TELEFÓN** [*yun.* tele və phone – səs] Danışığı uzaq məsafəyə verən qurğular sistemi – elektrik rabitə növü; habelə danışıq üçün siqnal zəngi və əldə tutmaq üçün dəstəsi olan aparat. ☐ **Telefon etmək (eləmək)** – zəng etmək, telefonla danışmaq. [Nisə xanım Zakirova:] [Şeyda] *Moskvadan telefon eləmişdi ki, Çaykovski salonundakı konsertlərə gedir*. Ə.Məmmədxanlı.

**TELEFONÇU** *is.* 1. Telefon stansiyası işçisi.

2. Telefon xətti çəkən hərbi rabitəçi. *Telefonçu bölməsi*.

**TELEFONLAŞDIRILMA** "Telefonlaşdırılmaq"dan *f.is.*

**TELEFONLAŞDIRILMAQ** *məch.* Telefonla, telefon rabitəsi ilə təmin edilmək.

**TELEFONLAŞDIRMA** "Telefonlaşdırmaq"dan *f.is. Telefonlaşdırma işləri*.

**TELEFONLAŞDIRMAQ** *f.* Telefonla, telefon rabitəsi ilə təmin etmək. *Kəndi telefonlaşdırmaq*.

**TELEFONOQRÁM** [*yun.* tele, phone və gramma] Telefon vasitəsilə verilən və qəbul edilərkən yazılan rəsmi məlumat; habelə üzərində belə məlumat yazılmış blank. *Telefonoqram müzakirəyə qoyulurkən qapı açıldı*. M.S.Ordubadi.

**TELEKİNÓ** [*yun.*] Televiziya verilişlərinin böyük kinoekranlarda göstərilməsi.

**TÉLEKS** *is.* [*ing.*] Beynəlxalq abonent teleqrafının telefonlu rabitə şəbəkəsi.

**TELEQRÁF** [*yun.* tele və grapho – yazıram] 1. Təcili məlumatları tez uzaq məsafəyə verən elektrik və ya radio rabitəsi növü. ☐ **Teleqraf agentliyi** – öz ölkəsinin və xarici ölkələrin həyatına dair mətbuat orqanlarına iqtisadi, siyasi və s. məsələlər haqqında məlumat verən idarə.

2. Belə məlumatları qəbul edən və verən rabitə idarəsi, habelə həmin idarənin yerləşdiyi bina; teleqrafxana. *Teleqrafda işləmək*.

3. Belə məlumatı verən və qəbul edən aparat. *Yeni markalı teleqrafı işə salmaq*.

**TELEQRAFÇI** *is.* Teleqramları qəbul edən və verən teleqraf işçisi. *Birdən teleqrafçı daxil olub Kərbəlayı Xəlilə bir teleqram verdi*. T.Ş.Simurq.

**TELEQRAFXANA** *is.* [*yun.* tele, grapho və *fars.* ...xanə] b a x **teleqraf** 2-ci mənada.

**TELEQRÁM** [*yun.* tele və gramma – yazı] Teleqrafla verilən xəbər, məlumat, habelə məlumat yazılmış blank. *Təbrik teleqramı. Teleqram göndərmək. Evdən teleqram almaq. – Xəlil izin almadan onun kabinetinə girəndə Tərlan yenicə alınmış teleqramları oxuyurdu*. M.Hüseyn.

**TELEMEXÁNİKA** [*yun.* tele və mechanike] *xüs.* 1. İstehsal proseslərinin rabitə vasitələrinin köməyilə uzaq məsafədən idarə olunması.

2. Bu cür idarə vasitə və üsullarını öyrənən elm sahəsi.

**TELEMEXANİKLƏŞDİRMƏ** *is.* İstehsal proseslərini uzaq məsafədən idarə etmək üçün rabitə vasitələrin tətbiq etmək.

**TELEOBYEKTÍV** [*yun.* tele və *lat.* objectum] Uzaqda olan şeylərin şəklini iri miqyasda çəkmək üçün foto və ya kinoaparat obyektivi.

**TELEPÁTİYA** *is.* [*yun.*] Hiss orqanlarının köməyi ilə fikir və hisslərin məsafəyə ötürülməsi.

**TELESKÓP** [*yun.* tele və skopeo – baxıram] Göy cisimlərini müşahidə etmək üçün optik astronomiya cihazı.

**TELETÁYP** [*ing.* teletype] Yazı maşını tipli klaviaturası olan, hərf çap edən teleqraf aparatı.

**TELETAYPÇI** *is.* Teletaypda işləyən rabitə işçisi.

**TELEVERİLİŞ** *is.* Televiziya verilişi. *Televeriliş vaxtı. Televeriliş proqramı*.

**TELEVÍZİYA** [*yun.* tele və *lat.* visio – görmə] Əksin elektrik və ya radiorabitə vasitəsilə uzaq məsafəyə verilməsi. *Televiziya proqramı. Televiziya antenası*. ☐ **Televiziya**

**mərkəzi** – televiziya verilişləri üçün texniki vasitələrlə təchiz olunmuş idarə.

**TELEVÍZOR** [*yun.* tele və *lat.* visio – görmə] Televiziya verilişlərini və onların səsini qəbul edən radiotexniki qurğu, cihaz. *Saat iki olar. Uşaqlar üçün; Televizor kino verəcək bu gün*. M.Rahim.

**TELLİ** *sif.* Telləri olan; tellərini alnına tökmüş; saçlı.

**TELLÚR** *is.* [*lat.*] Elementlərin dövrü sisteminin VI qrupunda kimyəvi element.

**TELSİZ** *sif.* Telləri olmayan, saçsız.

**TÉMA** [*yun.*] b a x **mövzu**.

**TEMATÍK** *sif.* [*yun.*] Müəyyən mövzuya (temaya) aid. *Mühazirələrin tematik planı*. // Hər hansı bir mövzuya (temaya) həsr olunmuş. *Tematik sərgi. Tematik konsert.*

**TEMÁTİKA** [*yun.* thematike] Mövzular, mövzular məcmusu. *Elmi əsərlərin tematikası. Ədəbiyyatda istehsalat tematikası.*

**TEMBR** [*fr.* timbre] Hər bir səs və ya musiqi aləti üçün səciyyəvi olan xüsusi səs keyfiyyəti, səs çaları; ton. *Musiqi ifadəliyinin bir çox mühüm ünsürləri* (*kök, vəzn, tembr və sairə*) *məhz melodiyanın tərkibində birləşərək bir vəhdət təşkil edir*. Ə.Bədəlbəyli.

**TEMP** [*lat.* tempus – vaxt] 1. Musiqi əsərinin ifasının sürət dərəcəsi. *Sürətli tempdə uvertüra. Ariyanın tempi*. // *idm*. Təkrar edilən hərəkətlərin və ya müntəzəm hərəkətin sürət dərəcəsi. *Qaçış tempi. Oyun sürətli tempdə keçdi.*

2. Bir şeyin həyata keçirilməsi, cərəyanı, sürəti, dərəcəsi. *Sənayenin inkişaf tempi. Silahlanma tempi. Hücum tempi.*

**TEMPERÁMENT** *is.* [*lat.*] Şəxsiyyətin psixi fəaliyyətində dinamik cəhətlərin xarakteristikası.

**TEMPERATUR** [*lat.* temperatura – vəziyyət] 1. Cismin istilik dərəcəsi. *Havanın temperaturu. Suyun temperaturu.*

2. İnsanın sağlamlıq vəziyyətini göstərən istilik dərəcəsi. *Xəstənin temperaturunu ölçmək. Yüksək temperatur*. // *dan.* Xəstəlik zamanı bədənin yüksək istilik dərəcəsi; istilik. *Uşağın temperaturu var.*

**TENDENSİYA** *is.* [*alm.*] 1. Meyil, fikir, ideya gedişatı.

2. Təmayül.

**TENDER**[1] *is.* [*ing.*] Paravozun su, yanacaq saxlanılan hissəsi.

**TENDER**[2] *is.* [*ing.*] 1. Təklif, arzu.

2. Müsabiqə (təkliflər müsabiqəsi).

**TÉNNİS** [*ing.* lawn tennis] Oyunçuların xüsusi meydançada topu raketkaların zərbəsilə tor üstündən bir-birinə atmasından ibarət idman oyunu. ☐ **Stolüstü tennis** – b a x **pinq-ponq**.

**TENNİSÇİ** *is.* Tennis oynayan oyunçu. *Tennisçilərin yarışı*.

**TÉNOR** [*ital.*] Ən uca zil kişi səsi. // Belə səsi olan müğənni. *Tenor artist.*

**TENT** [*ing.*] Günəş və yağışdan qorunmaq üçün parusin örtük. *Avtomaşının tenti*.

**TEOLOGİYA** *is.* [*yun.*] İlahiyyat, din elmi.

**TEORÉM** [*yun.* theorema – fikirləşirəm] Düzgün sübutlarla müəyyən edilən riyazi müddəa. *Teoremi sübut etmək. Pifaqor teoremi.*

**TEPLOXÓD** [*rus.*] Daxili yanacaq mühərriki ilə hərəkətə gətirilən gəmi.

**TEPLOVÓZ** [*rus.*] Daxili yanacaq mühərriki ilə hərəkətə gətirilən lokomotiv. *Teplovoz sürmək.*

**TERAPÉVT** [*yun.* therapeutes – xəstəyə qulluq edən] Daxili xəstəliklər mütəxəssisi olan həkim, can həkimi.

**TERAPÍYA** [*yun.* therapeia – qulluq etmə, müalicə] Təbabətin, daxili xəstəlikləri öyrənməklə məşğul olan sahəsi və onların dərmanlar və qeyri-cərrahi vasitələrlə müalicəsi.

**TÉRMİN** [*lat.* terminus – hədd, sərhəd] 1. Elm, texnika, incəsənət və s. müəyyən ixtisas sahəsinə aid anlayışı dəqiq ifadə edən söz (və ya söz birləşməsi); istilah.

2. Məntiqdə: hökmün tərkib elementi (subyekt və predikat).

**TERMİNÁTOR** *is.* [*lat.*] İşıqla kölgənin sərhədi.

**TERMİNOLÓGİYA** [*lat.* terminus və *yun.* logos – məfhum, təlim] Elmin, texnikanın, incəsənətin, ictimai həyatın hər hansı bir sahəsində işlədilən terminlərin məcmusu. *Dilçilik terminologiyası. Tibb terminologiyası.*

**TERMİNOLOJİ** *sif.* Terminologiyaya aid olan, terminologiya ilə əlaqədar olan. *Terminoloji lüğət.*

**termo...** [*yun.* thermos – isti] Xarici mürəkkəb sözlərin, istilik mənasında olan birinci tərkib hissəsi; məs.: termometr, termodinamika və s.

**TERMODİNAMÍK** *sif.* Termodinamikaya aid olan, termodinamika ilə əlaqədar olan. *Termodinamik müvazinət.*

**TERMODİNÁMİKA** [*yun.* thermos və dynamikos] Fizikanın, istiliyin müvazinət qanununu və enerjinin başqa növlərinə keçməsi hallarını öyrənən bəhsi.

**TERMÓQRAF** [*yun.* thermos və grapho – yazıram] Temperaturun dəyişməsini avtomatik qeyd edən cihaz.

**TERMÓMETR** [*yun.* thermos və metreo – ölçürəm] Hərarətölçən cihaz. *Civəli termometr. Termometrlə xəstənin hərarətini ölçmək. – Aydın termometri yoxlayıb uşağın qoltuğuna qoyduqdan sonra ondan soruşdu.* H.Seyidbəyli.

**TÉRMOS** [*yun.*] İçindəki isti və ya soyuq şeyi olduğu kimi saxlayan xüsusi qab. *Termosda sərin su var. Çayı termosa tökmək.* – [Firəngiz] *yolda termosa doldurduqları sərin sudan içdi, yeməyi yığışdırdı.* B.Bayramov.

**TERMOSTÁT** [*yun.* thermos və statos – duran] Daimi temperaturu saxlamaq üçün aparat. *Hava termostatı.*

**TERRAS** *is.* [*fr.*] 1. Dərə yamacları, göl və dəniz sahillərinin pilləvari relyef formaları.

2. Səki, meydança.

3. Eyvan, veranda, artırma.

4. Yer səthinin bir-birinin üstündə yerləşən üfüqi və ya bir az meyilli çıxıq hissələri.

**TERRÓR** [*lat.* therror – qorxu, dəhşət] Öz siyasi və sinfi düşmənlərinə qarşı onları cismən məhv etməyə qədər zorakı tədbirlər siyasəti; tədhiş. *Faşist terroru.*

**TERRORÇU** *is.* Fərdi terror tərəfdarı və iştirakçısı. *Terrorçu qrup.*

**TERRORÇULUQ** *is.* Terror siyasəti və taktikası; tədhişçilik. *Hərbi terrorçuluq.*

**TERSİYA** *is.* [*lat.*] 1. Diatonik qammanın üçüncü pilləsi.

2. Saniyənin $^{1}/_{60}$ hissəsi.

**TEST** *is.* [*ing.*] 1. İnsanın zehni inkişafını, bacarığını yoxlamaq üçün standart tapşırıq.

2. Ali məktəblərə qəbul imtahanlarının aparılması üsulu.

**TESTER** *is.* [*ing.*] Bir şeyi yoxlamaq, sınaqdan keçirtmək cihazı.

**TEŞT** *is.* [*fars.*] İri mis tas. [Dərviş:] *Xanım, buyurun, bir teşt su gətirsinlər.* N.Vəzirov. *Feyzi iç qovurmasını teştdə cızhacız gətirdi.* B.Bayramov.

**TET-A-TET** *zərf* [*fr.*] Təklikdə, üzbəüz.

**TEY** *sif. dan.* 1. Qatışığı olmayan, xalis, xəlitəsiz, saf. *Tey buğda unu.*

2. Tamam, bütün, səlt. *Xörək tey yağdır.* – [Banıxanım:] *Bağrımı döndərdin tey qızıl qana; Oğul, gedib, ağlar qoyma sən bizi!* "Aşıq Qərib".

**TEYF** *is.* [*ər.*] Qarabasma, kabus; vahimə.

**TEYXA** *zərf məh.* Tamam, tamamilə, büsbütün.

**TEYLƏMƏ** "Teyləmək"dən *f.is.*

**TEYLƏMƏK** *f.* İti bir şeylə yaralamaq; batırmaq. *Dərin-dərin dəryaları boyladı; Xəncər alıb qara bağrım teylədi.* Qurbani. *Həsrətin atmacası neştər olub Qüdrətin qəlbini teylədi.* Ə.Vəliyev.

**TEYLƏNMƏ** "Teylənmək"dən *f.is.*

**TEYLƏNMƏK** *məch.* İti bir şeylə deşilmək; yaralanmaq. *Səlbi boyun görən kimi əylənir; Yar ucundan bağrım başı teylənir.* "Əmrah".

**TEZ** *zərf* 1. Dərhal, gecikmədən, gecikdirmədən, əlüstü, az zaman ərzində, sürətlə, cəld. *Tez əlac etmək. – Telli tez qalxıb öz otağına çəkildi.* S.Hüseyn. *Sərvərov tez stol yeşiyindən kağız çıxarıb, əmr qaraladı, özü aparıb makinaçıya verdi.* Mir Cəlal. ☐ **Tez eləmək** – sürətləndirmək, gecikdirməmək, yubatmamaq. **Tez olmaq** – cəld hərəkət etmək, yubanmamaq. [Kərbəlayı Qurban:] *Tez ol, aç qapını, soyuq məni kəsdi.* Çəmənzəminli.

2. Qabaq, əvvəl. *Hamıdan tez işə gəlmək. – Bu gün kənd həmişəkindən tez oyanmışdı.* S.Qədirzadə.

**TEZALIŞAN, TEZALOVLANAN** *sif.* Tez alışıb-yanan, tez odlanan. *Tezalışan maddələr.*

**TEZBAZAR** *dan.* **tezbazar etmək** – 1) bir işi tələsik, keyfiyyətsiz, atüstü görmək. *Məsələni tezbazar həll etmək. Tapşırığı tezbazar*

*yerinə yetirmək*; 2) tez axırına çıxmaq, öldürmək. [Abbas:] *İlqarından dönən yarı; Tanrı tezbazar eyləsin!* “Abbas və Gülgəz”. **Tezbazar olmaq** – 1) atüstü, tələsik, keyfiyyətsiz görülmək (iş). *Bu lap tezbazar oldu*; 2) vaxtsız, tez etmək. *Kim bilsin,* [kişi] *hansı məqsəd üçün gəlirmiş, tezbazar olub.* Mir Cəlal.

**TEZBÖYÜYƏN** *sif. xüs.* Sürətlə böyüyən, tez boy atan. *Tezböyüyən balıq. Tezböyüyən ağac*.

**TEZCƏ** *zərf* Tez, tez bir zamanda. *Dərənin sinəsi ilə şaqqıldayıb axan sarı köpüklü sel tezcə yavaşıdı.* B.Bayramov. // Əlüstü, o saat, tez, dərhal, tez-tələsik. *Tezcə otaqdan çıxdıq. – Hələ çalınmamış biçənəyin bir tərəfində tezcə çadırlar qurulmağa başlandı*. B.Bayramov.

**TEZDƏN** *zərf* 1. Alaqaranlıqdan, hava açılmamışdan, sübh erkəndən. *Tezdən tarlaya getmək. – ..Məmmədhəsən əmi sübh tezdən yuxudan durub, geyinib, namaz qılıb çıxdı, bir həyəti dolandı*. C.Məmmədquluzadə. [Züleyxa] *tezdən qulluqçusunu ayağa qaldırdı*. S.Rəhimov.

2. Vaxtından əvvəl, qabaq, tez. *Gülsənəm arvad tezdən yatmadığına sevinirdi*. M.Hüseyn.

**TEZDƏYƏN** *sif.* Tezyetişən, pişraz. *Tezdəyən alça. – Tənəklərdə qoralar ətə-cana dolur, tezdəyən üzümlər xal salırdı*. İ.Qasımov.

**TEZƏRİYƏN** *sif.* Az hərarətdə əriyən. *Tezəriyən metallar*.

**TEZ-GEC** b a x **gec-tez**. *Tez-gec o cığırı tamamilə alaq basacaqdır*. Ə.Məmmədxanlı.

**TÉZİS** [*yun.* thesis] 1. *mənt.* Doğruluğu sübut edilməli olan müddəa. *Tezis irəli sürmək. Öz tezisini müdafiə etmək.*

2. Bir məruzənin, mühazirənin, məlumatın və s.-nin qısaca ifadə edilmiş əsas müddəaları (adətən cəm şəklində işlənir). *Tezis yazmaq. Mühazirənin tezisləri*. – [Nərgiz] *xitabət kürsüsünə yaxınlaşıb məruzəsinin tezislərini qarşısına qoydu.* Ə.Vəliyev.

**TEZKEÇƏN** *sif.* Tez yox olub gedən, uzun çəkməyən, sürəksiz. *Tezkeçən yağış* (*xəstəlik*).

**TEZLƏNDİRMƏ** “Tezləndirmək”dən *f.is.*

**TEZLƏNDİRMƏK** b a x **tezləşdirmək**.

**TEZLƏŞDİRMƏ** “Tezləşdirmək”dən *f.is.*

**TEZLƏŞDİRMƏK** *f.* Sürətləndirmək. [Adamlar] *qələbə gününü necə tezləşdirməyi fikirləşirlər*. M.İbrahimov.

**TEZLƏŞMƏ** “Tezləşmək”dən *f.is.*

**TEZLƏŞMƏK** *f.* Sürəti artmaq, sürətlənmək, daha da sürətli olmaq. [Adamlar] *əvvəlcə musiqiyə görə ağır, sonra musiqi tezləşdikcə tez-tez oynayırlar.* Ü.Hacıbəyov.

**TEZLİK** *is.* 1. Tez vaxt, az zaman; tez.

2. *xüs.* Hərəkətin, rəqsin və s.-nin vahid zamanda tez-tez olma dərəcəsini bildirən kəmiyyət. *Saat əqrəbinin tezliyi. – Ürək döyüntülərinin tezlik və qüvvəsi də orqanizmin tələblərilə tamamilə uyğun surətdə dəyişir.* “İnsan anatomiya və fiziologiyası”. *Bir saniyədə olan dövrlərin sayına dalğanın tezliyi deyilir*. “Radiolokasiya”. // Yeyinlik, itilik, sürət.

3. **Tezliklə** şəklində *zərf* – tez bir zamanda, yaxın vaxtda, çox yaxın gələcəkdə. *Tezliklə görüşmək*.

**TEZSINAN** *sif.* Davamsız, asanlıqla sınan, kövrək. *Tezsınan qab. Tezsınan ağac. Tezsınan material*.

**TEZ-TEZ** *zərf* 1. Hər anda, ara vermədən, aralarından çox keçmədən. *Cavan enişi çox çətinliklə enirdi, çünki yedəyindəki atın ayaqları yamacda tez-tez sürüşürdü.* E.Sultanov. *Qızlar bu gün Gülnazın çox narahat olduğunu, gizlincə tez-tez saata baxdığını hiss edirdilər.* Q.İlkin.

2. Həmişə, daim. [Əliqulu:] *Ancaq başsız qoymayacağam, tez-tez göz olacağam.* S.Rəhman. [Eldar:] *Biz sərhəd boyunda yaşayırıq, buralarda tez-tez qəribə və gözlənilməz hadisələr baş verir*. M.Rzaquluzadə.

3. Sürətli, sürətlə. *Tez-tez getmək. Tez-tez yemək*. – [Yasəmən:] *Onsuz da elə tez-tez danışırlar ki, heç nə yaza bilmirəm.* S.Rəhman.

**TEZ-TƏLƏSİK** *zərf* 1. Sürətlə, becid, tez-tez, çox tez, iti. *Tez-tələsik getmək. – Səkilər tez-tələsik yeriyən adamlarla dolu idi.* M.Hüseyn.

2. Cəld, əlüstü.

3. Keyfiyyətinə fikir vermədən; atüstü. *İşi tez-tələsik görmək. Paltarı tez-tələsik tikmək.*

**TEZYETİŞƏN** b a x **tezdəyən**. *Tezyetişən üzüm. – Kəndin aşağısında tezyetişən qırmızı alma növləri var.* S.Rəhman. // Faraş.

**TƏAM** *is.* b a x **taam**.

**TƏB**[1] *is.* [*ər.*] Şeir demək, musiqi yazmaq, mahnı oxumaq həvəsi, meyli; ilham. [Rüstəm bəy Sofyaya:] *Məndə təb əsla yoxdur, bircə dəfə, yadımdadır, bir qıza şeir yazmışdım, o da xoşuna gəlməmişdi*. Çəmənzəminli. *Mənə deməyin ki: – Bu təb, bu ilham; Bir cüt qanad olub səni ucaldar*. Ə.Cəmil. □ **Təbi açılmaq (gəlmək, cuşa gəlmək)** – ilhama gəlmək, şeir yazmağa və ya deməyə, musiqi yazmağa, mahnı oxumağa ruhlanmaq, ilhamlanmaq. *Kərəmin təbi cuşa gəldi.* "Əsli və Kərəm". *Şərab içdikdən sonra təb açılıb, şeir öz-özünə su kimi axacaqdır.* Ə.Haqverdiyev. *Az qalıb təbim də gəlsin, indicə şeir dəyəcəyəm*. Çəmənzəminli.

◊ **Təbdən çıxartmaq** – coşdurmaq, hirsləndirmək, özündən çıxartmaq, halını pozmaq. *Nə hədə-qorxu, nə atılan güllələr Bəndalını təbdən çıxara bilmədi*. Mir Cəlal. **Təbdən çıxmaq** – coşmaq, hirslənmək, özündən çıxmaq. *Şahpəri, qarının tamamilə təbdən çıxdığını görüb sarsıldı.* B.Bayramov. **Təbdən-təbə düşmək** – bir haldan başqa hala keçmək, əhvalı tez-tez dəyişmək, haldan-hala düşmək. *Beləliklə, Rüxsarə təbdən-təbə düşürdü*. S.Rəhimov. *..Veysəl kəlmə kəsmir, təbdən-təbə düşürdü.* B.Bayramov. **Təbi dəyişmək** – halı dəyişmək, əhvalı dəyişmək (pozulmaq). *Heydərin rəngi qaçdı, onun təbi dəyişdi*. S.Rəhimov.

**TƏB**[2] *is.* [*ər.*] *köhn.* Çap (etmə), nəşr (etmə). □ **Təb etmək** *köhn.* – çap etmək, nəşr etmək. *Kitabı təb etmək.* **Təb olunmaq** *köhn.* – çap olunmaq, nəşr olunmaq. *Məcmuə təb olundu*.

**TƏBABƏT** *is.* [*ər.*] Xəstəliklər, onların müalicəsi və qarşısının alınması haqqındakı elmlərin məcmusu; tibb. *Təbabət elmi. Təbabətə dair ədəbiyyat*.

**TƏBDİL** *is.* [*ər.*] *köhn.* 1. Dəyişmə, dəyişdirmə. □ **Təbdil etmək** – dəyişmək. *Havanın hər bir zərrəsi həmişə hərəkət edib yerini təbdil edər.* H.Zərdabi. **Təbdil olmaq** – dəyişilmək, əvəz olunmaq. *İyirmi beş il bundan irəli qəzet haqqında yazılan həcv və föhşlərin indi mədh və tərifə təbdil olması, əlbəttə, bizim üçün böyük bir mayeyi-iftixardır.* F.Köçərli.

2. *xüs.* Mövzusu başqa əsərdən götürülüb yeni mühitə, yeni şəraitə uyğun şəkildə işlənmiş ədəbi əsər. *Bakı işçi teatrı* [repertuar qıtlığını] *ləğv etmək üçün, başlıca olaraq, tərcümə və təbdillərdən istifadə edirdi.* C.Cəfərov.

**TƏBƏDDÜL** *is.* [*ər.*] *köhn.* Dəyişmə, başqa bir şəklə düşmə.

**TƏBƏDDÜLAT** *is.* [*ər.* "təbəddül" söz. cəmi] Dəyişiklik. *Bu böyük tarixi təbəddülatdan ruhlanan cənubi azərbaycanlılar da azadlıq mübarizəsini gücləndirmişdilər.* M.İbrahimov.

**TƏBƏƏ** *is.* [*ər.* "tabe" söz. cəmi] Bir dövlətə tabe olan, onun vətəndaşı olan əhali, adam. *İran təbəəsi.* – [Qoca:] *Hökmdar ilə təbəələr arasında sədlər çəkildi*. Çəmənzəminli.

**TƏBƏƏLİK** b a x **vətəndaşlıq** 1-ci mənada.

**TƏBƏXXÜR** *is.* [*ər.*] Buxarlanma, buğa çevrilmə. □ **Təbəxxür etmək** – 1) buxarlanmaq, uçub getmək, buğa çevrilmək. *Qaz təbəxxür etdi;* 2) *məc. zar.* yox olma, yoxa çıxmaq.

**TƏBƏQƏ**[1] *is.* [*ər.*] 1. Bir şeyin başqa bir şeyin üstünü örtən kütləsi və ya hissəsi; qat, lay. *Buz təbəqəsi. Hava təbəqəsi. – Qarın nazik təbəqəsi qırova bənzəyirdi.* M.Hüseyn. *Havaya qatı bozumtul toz təbəqəsi qalxırdı.* Ə.Əbülhəsən.

2. Adamların, əhalinin, cəmiyyətin öz ictimai, mədəni və s. əlamətlərinə görə yekcins olan hissəsi. *Əməkçilərin qabaqcıl təbəqəsi. Yoxsul təbəqə.* – [Məmməd:] *..Qızım Nərgizxanımı varlı yerə ərə vermə, çünki o təbəqə çox nanəcib olur*. "Aşıq Qərib".

**TƏBƏQƏ**[2] *is.* [*ər.*] Vərəq. *Katib canının dərdindən .. bərk qorxuya düşdü, bir neçə təbəqə kağız çıxarıb qabağına qoydu*. S.Rəhimov.

**TƏBƏQƏLƏŞMƏ** "Təbəqələşmək"dən *f.is. Tez-tez bir dəstə feodal təbəqəsinin hakimiyyəti digər dəstənin hakimiyyətilə dəyişilirdi, ictimai-siyasi təbəqələşmə güclənirdi*. M.İbrahimov.

**TƏBƏQƏLƏŞMƏK** *f.* İctimai, mədəni və s. cəhətdən yekcinsliyini itirərək təbəqələrə bölünmək (adamlar, cəmiyyət və s. haqqında).

**TƏBƏRRÜK** *is.* [*ər.*] 1. Dindarlara görə, xoşbəxtlik, uğur gətirən, xəstələri sağaldan müqəddəs torpaq, su, müqəddəs adamın geyiminin kiçik parçası və s. *Novruz bayramında təhvil saxlayıb, təhvil suyunun üstündə dava-mərəkə salardılar və ağsaqqal, qarasaqqal o təbərrük suyu qapış-qapış edərdilər*. Ə.Qəmküsar.

2. *məc.* Az tapılan, az ələ düşən hər bir şey. *Əlikram gətirdiyi iki dənə ortabab Quba almasını qəzetdən açıb təbərrük kimi çıxartdı.* B.Bayramov.

**TƏBƏRZİN** *is.* [*ər.*] 1. Baltaya bənzəyən qədim silah. *Orta Asiyanın qədim tayfalarının silahları ox, nizə, qılınc və təbərzindən ibarət imiş*.

2. Keçmişdə: dərvişlərin gəzdirdikləri aypara şəklində baltacıq. *Boynundan bir çox kiçik və iri muncuqlar asmış bir dərviş əlində kəşkül və təbərzin oxuya-oxuya gedir*. A.Şaiq.

**TƏBƏSSÜM** [*ər.*] 1. *is.* Gülümsəmə. [Qocanın] *sallaq iri dodaqlarında, yanları cizgilərlə bürüşmüş kiçik gözlərində, sümükləri qalxaq, ətli, qırmızı üzündə bir təbəssüm vardı*. A.Şaiq. *Xanların istehzalı təbəssümü birdən yoxa çəkildi*. M.Hüseyn. ☐ **Təbəssüm etmək (eyləmək)** – gülümsəmək. *Könlün xoş isə təbəssüm eylə! Mehrin var isə tərəhhüm eylə!* Füzuli. *Çün baxıb əhvalıma, etdi təbəssüm nazilən; Qönçeyi-bağı-behişti gör nə xəndan eylədi*. Heyran xanım.

2. **Təbəssümlə** şəklində *zərf* – gülümsəyə-gülümsəyə, gülümsəyərək. *Qətibə başını qaldırıb, Səba xanımın üzünə baxıb təbəssümlə dedi*. M.S.Ordubadi.

**TƏBİB** *is.* [*ər.*] Həkim. *Təbib olsam, yaraların bağlaram; Sinəm üstə düyünlərəm, dağlaram*. Aşıq Ələsgər. [Padşahın qızı:] *Məmləkətdə bir təbib qalmayıbdır ki, atam onu məni müalicə etmək üçün gətirməmiş olsun*. Ə.Haqverdiyev.

**TƏBİBLİK** *is.* Həkimlik. [Həkimbaşı:] *Mən qırx beş ildir ki, təbiblik edirəm*. Ə.Haqverdiyev.

**TƏBİƏT** *is.* [*ər.*] 1. Yerdə təbii şəraitin (yerin səthi, bitki aləmi, iqlim və s.) məcmusu; üzvi və qeyri-üzvi aləm, yerdə insan, fəaliyyəti ilə yaradılmamış hər şey. *Təbiətin qanunları. – Təbiət canlanır, bahar çağıdır; Bağçalar, yamaclar çiçəklənmədə.* A.Şaiq. // Hər hansı bir yerin xüsusiyyətlərinin məcmusu (onun relyefi, bitki və heyvanlar aləmi, iqlim şəraiti və s.). *Qafqazın təbiəti. Azərbaycanın dağlıq rayonlarının təbiəti. – Şimalın təbiəti çox zəngindir.* M.İbrahimov.

2. Şəhər və ya başqa yaşayış məntəqəsindən kənar yer və ya yerlər (meşə, dağ, çay və s.). *Təbiətə yaxınlıq. Təbiətə çıxmaq. – İnci heyrətlə təbiətin bu gözəlliyinə tamaşa edir*. A.Şaiq. *Hər yamacda bir tamaşa; Könlüm uçur dağa-daşa; Seyr etdikcə təbiəti.* M.Müşfiq.

3. Xasiyyət, xarakter. [Badisəba:] *Zatən, təbiətimiz* [Muradla] *bir-birinə uyğun gəldi, mən də fırtına keçirməyi sevmərəm.* Çəmənzəminli. *Bu iki adamın* [Kərim baba və Ayrım qızının] *təbiəti bir-birinə əsla uymurdu.* A.Şaiq.

**TƏBİƏTCƏ** *zərf* Təbiətinə görə, xasiyyətinə görə; xasiyyətcə; təbiətən. *Mehriban açıqdan-açığa görürdü ki, Səlim əxlaq və təbiətcə ətrafında gəzib-dolaşan, evinə qonaq gələn* [kişilərin] *heç birinə bənzəməyir.* S.Hüseyn.

**TƏBİƏTÇİ** b a x **təbiətşünas**. Gənc təbiətçilər dərnəyi.

**TƏBİƏTƏN** *zərf* [*ər.*] Xilqətcə, fitrətən, yaradılışında. [Fərman] *təbiətən diribaş yaranmışdı*. Ə.Sadıq. // B a x **təbiətcə**. *Şirzad bilirdi ki, Rüstəm kişi təbiətən məğlub olmağı, ikincilər cərgəsində oturmağı, dalda qalıb ayağını sürüməyi sevmir*. M.İbrahimov. *İsmayılzadə təbiətən diplomatik hiylələrə yad bir adamdı*. M.Hüseyn.

**TƏBİƏTŞÜNAS** *is.* [*ər.* təbiət və *fars.* ...şünas] Təbiətşünaslıqla məşğul olan adam, təbiətşünaslıq alimi; təbiətçi, naturalist. [Qoşatxan] *üzünü müdirə tutdu: – Sən təbiətşünassan, Həsən bəy Zərdabini tanıyarsan.* M.İbrahimov.

**TƏBİƏTŞÜNASLIQ** *is.* Təbiət hadisələri və qanunauyğunluqları haqqında elm; təbiət elmləri.

**TƏBİİ** *sif.* [*ər.*] 1. Təbiətə (yer səthinə, iqlimə, heyvan və bitki aləminə və s.) məxsus olan, təbiət tərəfindən yaradılmış. *Ölkənin təbii sərvətləri. Təbii sərhədlər. Təbii otlaqlar.*

2. Təbiət qanunlarından irəli gələn, törəyən, onlardan asılı olan. *Təbii ölüm.*

3. Anadangəlmə, fitri. *Üzün təbii rəngi. – Hüseyn öz təbii gözəlliyə malik səsinə hakim, bu səsi məharətlə idarə etməyi bacaran bir aktyor idi.* S.Rəhman.

4. Adi, normal. *Bu iş bizə təbii göründü. – Səadət və əmin-amanlıq məişətimizin əsil rəngi, əsil boyası kimi təbii və adi bir şey idi.* M.İbrahimov.

5. Həqiqi, əsil, natural (*süni* əksi). *Təbii ipək. Təbii dəri. – Deməli, təbii mis və ya təbii kükürd izotopların qarışığından ibarətdir.* C.Zülfüqarlı.

6. *Ara s.* Əlbəttə, yəqin ki, şübhəsiz ki. *Təbii, siz də iştirak edəcəksiniz.*

7. **Təbiidir, təbiidir ki** şəklində *ara s.* – adi haldır, normaldır, belə də olmalıdır. *Təbiidir ki, bu inam kolxoz sədri Rüstəm kişinin ürəyində daha güclü idi.* M.İbrahimov.

◊ **Təbii halından çıxmaq (çıxarmaq)** – adi halından çıxmaq (çıxarmaq), hirslənmək (hirsləndirmək). *Bu cür söhbətlər sıra ilə duran qızları təbii halından çıxarmaqda idi.* M.S.Ordubadi. **Təbii seçmə** *biol.* – canlı təbiətin elə bir inkişaf prosesidir ki, bu prosesdə həyatın dəyişməkdə olan şəraitinə ən çox uyğunlaşan orqanizmlər yaşayıb öz varlığını saxlayır. *Darvin yaxşı uyğunlaşanların qalmasına və pis uyğunlaşanların tələf olmasına təbii seçmə adını vermişdir.* M.Axundov.

**TƏBİİLİK** *is.* Təbii, qeyri-süni şeyin halı (*sünilik* əksi). *Qızın səsində bir təbiilik var idi.* İ.Əfəndiyev.

**TƏBİL** *is.* [*ər.*] İri nağara. *Səhnənin dalından təbil və sinc səsi gəlir.* Ə.Haqverdiyev. [Cavanşir:] *Qoy şeypurlar gurlasın, təbil səsləri dağları titrətsin.* M.Hüseyn.

**TƏBİLÇİ** *is.* Təbil çalan çalğıçı. *Təbilçi Qurban, Qara Məlikin gecələr xəlvətcə Təbrizə gəlib, Rüxsarə ilə görüşdüyünü Nəsrəddinə xəbər verdi.* M.S.Ordubadi.

**TƏBİR** *is.* [*ər.*] 1. Söz, kəlmə, ifadə.

2. Yozma. □ **Təbir etmək** – yozmaq, məna çıxarmaq, məna vermək. *Məhsəti xanımın hökumət əleyhinə olmasında şeir və sənəti əxlaq pozğunluğu kimi təbir edənlər müqəssirdir.* M.S.Ordubadi.

3. **Təbirincə, təbiri ilə, təbirinə görə** şəklində – ...dediyi kimi, ...sözləri ilə desək. *Evin balaca qızı Ulduz isə, anasının təbirinə görə, od-alov idi.* Ə.Məmmədxanlı.

◊ **Təbir caizsə, təbir caiz görülsə** – ...demək olarsa, ...demək mümkündürsə, ...demək münasibdirsə. *Təbir cayiz görülsə, demək olar ki, Hacı Aslan bu küçənin can damarı misalında idi.* S.Hüseyn. *Qazançalara termosdan isti xörək .. töküldü və təbir caizsə, ziyafət başlandı.* Ə.Əbülhəsən.

**TƏBİYYAT** *is.* [*ər.*] *köhn.* Təbiət elmləri.

**TƏBİYYATÇI** *is. köhn.* b a x **təbiətşünas**.

**TƏBLİĞ** *is.* [*ər.*] Hər hansı bir əqidəni, nəzəriyyəni, biliyi və s.-ni yayma və dərindən başa salma. *Elmi biliklərin təbliği.* // Geniş kütlələrə siyasi cəhətdən təsir göstərmə. □ **Təbliğ etmək** – 1) hər hansı bir fikri, nəzəriyyəni, əqidəni və s.-ni yazılı və ya şifahi surətdə yaymaq; 2) *dan.* bir fikri, əqidəni və s.-ni başqasına inandırmağa, ona təsir göstərməyə çalışmaq. *Qardaşım dün gecə iclasdan çıxıb; Doyunca atamı təbliğ eylədi.* M.Müşfiq.

**TƏBLİĞAT** *is.* [*ər.* "təbliğ" söz. cəmi] Bir nəzəriyyəni, ideyanı, biliyi və s.-ni kütlə arasında yayma, təbliğ etmə. □ **Təbliğat aparmaq** – bir nəzəriyyəni, ideyanı, biliyi şifahi surətdə kütlə arasında yaymaq, intişar etmək, təbliğ etmək.

**TƏBLİĞATÇI** *is.* Təbliğatla məşğul olan adam. *Kitabxanaçı həm də kitab təbliğatçısıdır.* // Partiyanın qərarlarını mühazirə və müsahibələrində izah edən, siyasi məşğələlərə rəhbərlik edən partiya üzvü. *İnqilabdan sonra kəndə gələn təbliğatçılardan Molla Xəlil çox qorxmuşdu.* S.Hüseyn.

**TƏBLİĞATÇILIQ** *is.* Təbliğat aparma, təbliğatçının apardığı ictimai iş.

**TƏBRİK** *is.* [*ər.*] Xoş xəbər, sevindirici hadisə, bayram və s. münasibətilə yazılı və ya şifahi gözaydınlığı. *Təbrik məktubu.* – [Qulamrza:] *Bu gün hər yerdə təbriklə qarşılanmışam.* Çəmənzəminli. .. *İranın hər tərə-*

*fində yaşayan azərbaycanlılar firqənin müqəddəs məramını alqışlayır, minlərlə məktub və təbrik teleqramları göndərirlər.* M.İbrahimov. ☐ **Təbrik etmək** – xoş xəbər, sevindirici hadisə, bayram və s. münasibətilə yazılı və ya şifahi olaraq birinə gözaydınlığı vermək. *Komissar əvvəlcə* [döyüşçüləri] *təbrik etdi*. Mir Cəlal. [Mirpaşa Sevincə:] *Saray açılanda sizi fəhlələr, bütün rayon təbrik edəcək*. Z.Xəlil.

**TƏBRİKLƏMƏ** "Təbrikləmək"dən *f.is.*

**TƏBRİKLƏMƏK** *f.* Təbrik etmək.

**TƏBRİKNAMƏ** *is.* [*ər.* təbrik və *fars.* ...namə] Yazılı təbrik, təbrik məktubu. *Yubiley münasibətilə təbriknamə göndərmək*.

**TƏCAVÜZ** *is.* [*ər.*] 1. Başqa bir dövlətin ərazisini zəbt etmək, azadlığını əlindən almaq və ya məhdudlaşdırmaq, demokratiyanı boğmaq və irticaçı rejimlər yaratmaq məqsədilə onun üzərinə hücum etmə. // Hücum, həmlə, basqın. *Düşmənin qəfil hava təcavüzünə uğramamaq üçün uzun-uzadı əsgər sıraları səkilərdə divar dibi ilə yeriyirdi.* Ə.Əbülhəsən.

2. Zorakılıq, təzyiq, zülm, sıxıntı. *Yasavulbaşı bilirdi ki, bəlkə də xan özünə qarşı edilən sui-qəsdi əfv edə bilər, amma elə, xalqa qarşı təcavüzü əsla bağışlamaz*. M.Rzaquluzadə. // Hüququna toxunma, haqsızlıq etmə, haqsızlığa yol vermə. *..Əsgər keçən yerdə heç bir qız və qadın özlərini kişilərin təcavüzündən saxlamağa qadir deyildi*. Çəmənzəminli. ☐ **Təcavüz etmək** – hüququna toxunmaq, zorakılıq etmək, qəsd etmək. [Gözəl:] [Ölkəmizdə] *adam döymək, adam öldürmək, birisinin malına və torpağına təcavüz etmək yoxdur.* M.S.Ordubadi.

**TƏCAVÜZÇÜ** b a x **təcavüzkar**.

**TƏCAVÜZÇÜLÜK** b a x **təcavüzkarlıq**.

**TƏCAVÜZKAR** *is.* və *sif.* [*ər.* təcavüz və *fars.* ...kar] Təcavüz edən, təcavüz (hücum) edən tərəf; qəsbkar, təcavüzçü. *Təcavüzkar bloklar. – Şimali Atlantika İttifaqının təcavüzkar mahiyyətini hər kəs anlaya bilər.* M.İbrahimov.

**TƏCAVÜZKARCA(SINA)** *zərf* Təcavüzkar kimi; qəsbkarcasına. *Təcavüzkarcasına hərəkət etmək*. // Düşməncəsinə.

**TƏCAVÜZKARLIQ** *is.* Təcavüz etmə, təcavüz siyasəti, başqa dövlətin torpağını tutmaq üçün onun üzərinə hücum etmə; qəsbkarlıq. *İmperializm təcavüzkarlığı. Təcavüzkarlıq müharibəsi*.

**TƏCDİD** *is.* [*ər.*] Təzələtmə, yenilətmə.

**TƏCƏDDÜD** *is.* [*ər.*] Yenilənmə, təzələnmə.

**TƏCƏLLA** *is.* [*ər.*] Əyan olma, görünmə, təzahür etmə

**TƏCƏSSÜM** *is.* [*ər.*] Bir şeyin maddi, cismani ifadəsi, təzahürü. ☐ **Təcəssüm etmək** – görünmək, göz önünə gəlmək, cismani şəkildə təzahür etmək, canlanmaq. *Bu cavanlıq xatirəsi dərhal Bəhramın xəyalında canlandı və gəlib gözlərinin önündə təcəssüm etdi*. Ə.Vəliyev.

**TƏCHİZ** *is.* [*ər.*] Lazımi şeyləri tədarük etmə, hazırlayıb vermə. ☐ **Təchiz etmək** – lazım olan şeyləri vermək, təmin etmək.

**TƏCHİZAT** *is.* [*ər.* "təchiz" söz. cəmi] Hər hansı təşkilat və ya əhalinin maddi ehtiyaclarını təmin etmək üçün lazım olan şeylərin, avadanlıq və s.-nin məcmusu. *Təchizat idarəsi. Mərkəzi təchizat orqanları*. – [Hacıyev:] *Bu üsul texniki təchizat, material cəhətdən varlı olan trestlər üçündür*. Mir Cəlal.

**TƏCHİZATÇI** *is.* Təchizat orqanları işçisi, təchizat idarəsi işçisi, təchiz etməklə məşğul olan (idarə, işçi).

**TƏCİL¹** *is.* [*ər.*] *klas.* 1. Tələsdirmə. ☐ **Təcil etmək (qılmaq)** – tələsmək. *Əksiliyini budur yəqin bil; Bəs qılma dəxi işində təcil.* Xətayi. *Bəs ki eylərdi sübh üçün təcil; Hər dəqiqə gəlir ona bir il.* S.Ə.Şirvani.

2. *fiz.* Vaxt vahidi müddətində sürətin dəyişmə kəmiyyəti.

**TƏCİL²** *is.* [*ər.*] *klas.* Möhlət vermə, müəyyən bir vaxta qədər təxir etmə.

**TƏCİLƏN** *zərf* [*ər.*] Təcili (surətdə), tələsik, tez-tələsik, yubanmadan. *Məşədi Əsgər təcilən* [müsafirə] *tərəf yan alıb çamadanını aparmaq üçün öz dili ilə ona iltica etdi.* S.M.Qənizadə.

**TƏCİLİ** *zərf* [*ər.*] 1. Tələsik, tez, dərhal, əlüstü, çapıq. *Təcili cavab. Adamlar təcili hazır oldular.* – [Kərəm] *Qaragözə təcili çay hazırlatdı..* M.İbrahimov. *Bahadurun .. təcili gedişi Rənanın ürəyində dərin bir kədər doğurdu.* S.Rəhman.

2. Gecikdirilə bilməyən, tez edilməli olan; təxirsiz, təxirəsalınmaz. *Təcili iş. Təcili tapşırıq. – Keçmiş vaxtlarda dəftərxanalarda qulluqçuların gündə biri idarə bağlandıqdan sonra qalıb təcili məktubları, teleqramları qəbul edərdi.* Ə.Haqverdiyev. *Uşaq ki bu qədər həyəcanlı çığırırdı, deməli, təcili məsələ vardı.* B.Bayramov.

◊ **Təcili yardım** – 1) təxirə salınması mümkün olmayan hallarda xəstələnənlərə, zərərdidələrə ilk tibbi yardım göstərmək və müalicə müəssisələrinə aparıb çatdırmaqla məşğul olan tibb-sanitar idarəsi; 2) həmin iş üçün istifadə olunan avtomobil.

**TƏCNİS** *is.* [*ər.*] *ədəb.* Cinas üzərində qurulub əsasən üç, bəzən də beş bənddən ibarət klassik və aşıq ədəbiyyatında işlədilən lirik şeir formalarından biri. *Aşıq Ələsgərin* "*Qarlı dağlar gəldi, düşdü araya*" *təcnisi.*

**TƏCRİD** *is.* [*ər.*] Ayırma, təkləmə. □ **Təcrid edilmək (olunmaq)** – ayrılmaq, başqalarından ayrı saxlanmaq, təklənmək. **Təcrid etmək** – ayırmaq, başqalarından ayrı saxlamaq, təkləmək. *Yoluxucu xəstəliklərə tutulanları təcrid etmək.*

**TƏCRÜBƏ** *is.* [*ər.*] 1. Sınama, sınaq, yoxlama. *Təcrübə uçuşu. Təcrübə müddəti. Təcrübə məşğələləri. – Bu ildən təcrübə üçün xüsusi bir sahədə əkməyə icazə verdilər.* M.Rzaquluzadə. □ **Təcrübə etmək (aparmaq)** – təcrübə yolu ilə yoxlamaq, sınamaq. *Yeni buğda növü üzərində təcrübə aparmaq. – İndi .. addımlayan ekskavatorla yükləməyi də təcrübə etmək pis olmazdı.* Ə.Sadıq. **Təcrübədən çıxmaq** – yoxlanmaq, sınanmaq. **Təcrübədən çıxmış** – təcrübəli, bərkdən-boşdan çıxmış, sınaqdan çıxmış, sınanmış. *Bir para təcrübədən çıxmış dovşanlar çarpaz yolla qaçaraq tazıları çaşdırar, arabir də vaz atardılar.* H.Sarabski. **Təcrübədən keçirmək** – yoxlamaq, sınamaq. *Məhsuldar pambıq növünü təcrübədən keçirmək.*

2. Tədqiq etmək üçün hər hansı bir hadisəni süni surətdə yaradılmış şəraitdə təkrar etmə; elmi bilikləri laboratoriya yolu ilə yoxlama. *Təcrübə gözlənilən nəticəni vermədi. Alimin apardığı təcrübələr müsbət nəticə verdi.* – [Yaşarın] *bu axırıncı təcrübəsindən bir şey çıxarsa, bütün kimya elmində bir inqilabdır..* C.Cabbarlı. *Bir ay sonra Murad klinik təcrübəsini yarımçıq buraxıb, Bakıya getdi.* Çəmənzəminli.

3. Həyatdan, praktiki fəaliyyətdən və s.-dən əldə edilmiş biliklərin, vərdişlərin məcmusu. *İstehsalat yenilikçilərinin təcrübəsi. Həyat təcrübəsi.* – [Məşədi Həsən:] *Şəxs dünyada nə qədər ömür etmiş olsa, bir eylə onun təcrübəsi artıq olar.* Ə.Haqverdiyev. // Keçmişdə olmuş, işdə, həyatda yoxlanmış, sınanmış, əvvəllər təsadüf olunmuş şey. *Şəxsi təcrübənin nəticəsi. – Özümə görə də təcrübə hasil eləmişəm.* C.Məmmədquluzadə.

4. Adamların, cəmiyyətin yaşaması üçün lazım olan şəraiti yaratmağa yönəldilmiş fəaliyyətin məcmusu; praktika. *Nəzəriyyənin təcrübəyə təsiri.*

5. Hər hansı nəticələrin, müddəaların praktik işdə tətbiqi və yoxlanması. *Səmərələşdirici təklifləri təcrübədə tətbiq etmək.*

6. Hər hansı bilik və vərdişlərin işdə tətbiq edilməsi, bir işi yaxşı mənimsəmək üçün müntəzəm məşğul olma, təlim keçmə. *Gənc fəhlə birillik təcrübədən sonra usta oldu. – Keçən illərin təcrübəsi göstərmişdi ki, çoxlu pambıq götürmək üçün birinci şərt torpağı əvvəlcədən hazırlamaqdır.* İ.Əfəndiyev. // Tələbələrin, şagirdlərin və b.-nın nəzəri biliklərinin, tədris prosesinin tərkib hissəsi kimi işdə tətbiqi və sabitləşməsi. *Tələbələrin pedaqoji təcrübəsi. İstehsalat təcrübəsi.*

**TƏCRÜBƏÇİ** *is.* 1. Təcrübə keçən, praktikant. *Təcrübəçi tələbə.* // B a x **stajçı**. *Təcrübəçi çilingər. Təcrübəçi toxucu.*

2. Adətən hər hansı kənd təsərrüfatı bitkiləri yetişdirmək, yeni növlər almaq və s. məqsədlərlə təcrübə keçirən adam. *Təcrübəçi seleksioner. Təcrübəçi bağban.*

**TƏCRÜBƏÇİLİK** *is.* Təcrübə ilə məşğul olma, təcrübəçinin (2-ci mənada) gördüyü iş; təcrübə işi. *Təcrübəçiliklə məşğul olmaq.*

**TƏCRÜBƏLƏNMƏ** "Təcrübələnmək"dən *f.is.*

**TƏCRÜBƏLƏNMƏK** *f.* Təcrübə qazanmaq, təcrübəli olmaq, təcrübə əldə etmək. "*Yatağan*" *balıqlar artıq* "*təcrübələnmişdilər*". *Təhlükə hiss edən kimi qayanın altına şütüyür, .. dəlmə-deşiyə dürtülürdülər.* İ.Hüseynov.

**TƏCRÜBƏLİ** *sif.* Bir işdə, ixtisasda, sənətdə, peşədə təcrübəsi, biliyi, vərdişi, böyük səriştəsi olan. *Təcrübəli müəllim. Təcrübəli sürücü. – Fərman verir qoşunlara ağsaqqal; Təcrübəli, acıqlı bir general.* A.Səhhət. *Mədən işlərinə olan böyük həvəsi sayəsində* [Araz] *artıq ən təcrübəli bir usta olmuşdu.* A.Şaiq. // Böyük həyat təcrübəsi olan, bərkdən-boşdan çıxmış; dünyagörmüş. *Təcrübəli qadın.* – [Məşədi Həsən:] *..Upravada gərək təcrübəli adamlar əyləşsinlər.* Ə.Haqverdiyev. *Təcrübəli Fərhadoğlu vurnuxur, nə isə qəti bir qərara gələ bilmirdi.* S.Rəhimov.

**TƏCRÜBƏLİLİK** *is.* Təcrübəli olma, təcrübəli adamın hal və keyfiyyəti. *Həkimin təcrübəliliyi.*

**TƏCRÜBƏSİZ** *sif.* Təcrübəsi, biliyi, vərdişi olmayan və ya az olan. *Təcrübəsiz usta.* – *..Onda da bu quşlar təcrübəsiz və əsəbi ovçunu diksindirər..* M.Rzaquluzadə. *Barama bəsləmək çox incə və çətin iş olduğundan təcrübəsiz adam onun öhdəsindən gələ bilməz.* Ə.Sadıq. // Həyat təcrübəsi olmayan, bərkdən-boşdan çıxmamış. [Nazir:] *Siz .. görürəm, təcrübəsiz bir gəncsiniz.* S.Hüseyn.

**TƏCRÜBƏSİZLİK** *is.* Təcrübənin olmadığı hal, təcrübənin olmaması. *Təcrübəsizlikdən qəzaya yol vermək.*

**TƏCRÜBƏVİ** *sif.* [*ər.*] Təcrübəyə aid olan, təcrübə üçün olan, təcrübə ilə bağlı olan; əməli, təcrübi. *..K.A.Timiryazev birinci dəfə olaraq enerjinin saxlanması qanununu fotosintezdə təcrübəvi surətdə isbat etmişdir.* "Bitki fiziologiyası".

**TƏCRÜBİ** [*ər.*] 1. B a x **təcrübəvi**. *Şiraslanın indiki təcrübi işi, gərgin vəziyyəti heç də onun ötən arzularından ayrılmırdı.* S.Rəhimov.

2. *sif.* Təcrübəyə əsaslanan, eksperimental. *Təcrübi elmlər. Təcrübi təbabət. Təcrübi metod. Təcrübi yolla sübut etmək.*

**TƏDARÜK** *is.* [*ər.*] Bir şeyi qabaqcadan hazırlama; bir işi görmək üçün əvvəlcədən hazırlıq görmə; hazırlıq, ehtiyat. *Yun tədarükü. Heyvanlar üçün yem tədarükü.* // Həmin şeylərin özü. *Bəylə xanımın çamadanı və yol tədarükü daşındı.* Ə.Vəliyev. ☐ **Tədarük etmək (görmək)** – (qabaqcadan) hazırlamaq, hazırlıq görmək, ehtiyat görmək. [Əmir:] *Mürəxxəssiniz, gedin, qoşun tədarük edin.* Ü.Hacıbəyov. [İmamverdi:] *Gülpəri, tez ol, nahar tədarük et, Hacı Nəsir yol gəlib, acdır.* S.S.Axundov; // hazırlaşmaq, hazırlıq görmək. [Kəblə Rəcəbəli:] *Çox gözəl! Axşam üçün tədarük görərik.* Ə.Haqverdiyev.

**TƏDARÜKÇÜ** *is.* Tədarük işi ilə məşğul olan adam. *Ət tədarükçüsü.*

**TƏDAVİ** *is.* [*ər.*] *köhn.* Müalicə etmə, müalicə aparma; müalicə.

**TƏDAVÜL** *is.* [*ər.*] *iqt.* Əmtəə təsərrüfatında: əmək məhsulunu və başqa mülkiyyət obyektlərini alğı-satqı yolu ilə dəyişmə forması. *Əmtəə tədavülü.*

**TƏDBİR** *is.* [*ər.*] 1. Bir işi görmək, həyata keçirmək üçün üsul(lar), vasitə(lər), yol(lar). *Məhsuldarlığı artırmaq tədbirləri. Ərzaq problemini həll etmək üçün tədbirlər. Kütləvi tədbirlər.* ☐ **Tədbir tökmək (görmək)** – bir şeyi əldə etmək üçün fikirləşib yollar aramaq, yol tapmaq. [Əsgər Süleymana:] *İndi, aşna, bir iş də var, hərgah ona da bir tədbir töksən, onda bilərəm ki, başdan-ayağa qədər ağıllısan.* Ü.Hacıbəyov. // *məc.* Bir şeyi əldə etmək üçün düşünülən yol, vasitə, üsul; hiylə. *Dəlini zəncirlə yox, tədbirlə tutarlar.* (Ata. sözü). ☐ **Tədbir etmək** – qərarlaşmaq, qərara gəlmək. [Səfər:] *Divan tədbir edib sizi tutmağa; Meydanı qızdırıb at oynatmağa.* H.K.Sanılı.

2. Təhlükədən qorunmaq üçün görülən hazırlıq. *Qripə qarşı mübarizə tədbirləri.*

**TƏDBİRLİ** *sif.* Tədbirlə iş görən, ehtiyatlı, işini bilən, ağıllı. [Seyid:] *Bax, indi gör ki, mən necə tədbirli şəxsəm.* Ə.Haqverdiyev. *Ona elə gəldi ki, qarşısında çox ağıllı, tədbirli .. bir adam dayanmışdı.* B.Bayramov.

**TƏDHİŞ** *is.* [*ər.*] *köhn.* Dəhşətə salma; çaşdırma. // Terror.

**TƏDHİŞÇİ** *is. köhn.* Terrorçu.

**TƏDİYƏ** *is.* [*ər.*] *mal.* Ödəmə, ödənmə; ödənilən məbləğ. *Tədiyə borcu.* ☐ **Tədiyə etmək** – borcunu ödəmək. [Yaşlı kişi:] *Vaxtlı-vaxtında verəcəyini tədiyə edərdi, aramızda veksel olmazdı.* S.Hüseyn.

**TƏDİYƏÇİ** *is.* Borcunu verən, ödəyən.

**TƏDQİQ** *is.* [*ər.*] 1. Bir şeyi və ya onun xüsusiyyətlərini öyrənmək, müəyyənləşdirmək məqsədilə dəqiq elmi araşdırma;

tədqiqat. *Torpağın tədqiqi. Arktikanın tədqiqi. Atom enerjisindən istifadə sahəsində tədqiq.* □ **Tədqiq etmək** – 1) elmi cəhətdən araşdırmaq, öyrənmək, tədqiqat aparmaq. [Nərgiz:] *Tapılan şeyləri biz yuxarı göndəririk, orada alimlər tədqiq edirlər.* B.Bayramov; 2) bir şeyi müəyyənləşdirmək üçün diqqətlə ona baxmaq, gözdən keçirmək. *Mərdan .. yarımişıq otaqda çocuğun üzünü tədqiq etməyə başladı, özünə bənzər cəhətlər aradı.* Çəmənzəminli.

2. Cəm şəklində **tədqiqlər** – elmi əsər(lər), tədqiqat əsər(lər)i. *Azərbaycan dili tarixinə aid tədqiqlər.*

**TƏDQİQAT** *is.* [*ər.* "tədqiq" söz. cəmi] 1. B a x **tədqiq** 1-ci mənada. *Elmi tədqiqat institutu. Tədqiqatın nəticəsini istehsalata tətbiq etmək.*

2. B a x **tədqiq** 2-ci mənada.

**TƏDQİQATÇI** *is.* Bir şeyi tədqiq etməklə, dərindən öyrənməklə məşğul olan, tədqiqat aparan adam, alim. *Tədqiqatçıların çıxardıqları elmi nəticələr.*

**TƏDQİQATÇILIQ** *is.* Tədqiqatla məşğul olma, tədqiqat işləri aparma; tədqiqat işi.

**TƏDRİC** *is.* [*ər.*] 1. Dərəcə-dərəcə, yavaş-yavaş irəliləmə (irəlilətmə), az-az hərəkət.

2. *ədəb.* Bədii əsərdə ifadənin mənaca getgedə, dərəcə-dərəcə qüvvətlənməsi, yaxud zəifləməsi.

**TƏDRİCƏN** *zərf* [*ər.*] Yavaş-yavaş, tədriclə, az-az, dərəcə-dərəcə. *Keçəngünkü hadisədən və gecəki ciddi iztirablardan sonra Əbiş tədricən öz mühakiməsini itirmək üzrə idi.* S.Rəhimov.

**TƏDRİCİ** *sif.* [*ər.*] Yavaş-yavaş olan, yavaş-yavaş baş verən, cərəyan edən. *Tədrici hərəkət.*

**TƏDRİCLƏ** b a x **tədricən**. *İnsan hər şeyə tədriclə alışır. – ..Firiduna elə gəldi ki, onu da yavaş-yavaş, tədriclə çürütmək üçün* [zindana] *salmışlar.* M.İbrahimov. *Sahibsiz uşaqları tədriclə uşaq evlərinə yığacaqdılar.* Ə.Sadıq.

**TƏDRİS** *is.* [*ər.*] Dərs vermə; dərs oxuma, təhsil alma, dərs keçmə. *Ali məktəbdə xarici dillərin tədrisi. Tədris planı. – Darülfünuna daxil olduğum tədris ili darülfünun tələbələrinin tətili ilə başlandı.* T.Ş.Simurq.

**TƏƏCCÜB** *is.* [*ər.*] 1. Qeyri-adi, gözlənilməz, qəribə, anlaşılmaz şeydən doğan güclü təəssürat nəticəsində insanda əmələ gələn hal; heyrət. *Asəf onları heyrət və təəccüb içərisində Altun qəsrdən çıxardı.* M.S.Ordubadi. [Nuriyyə:] *..Muradın baxışlarındakı təəccübü hiss edərək daha ciddi bir görkəm aldım.* İ.Əfəndiyev. □ **Təəccüb etmək (eləmək)** – təəccüblənmək, heyrətlənmək. *Mənə can verməda minlərcə polad zərbəçilər; Gördüyüm işlərə düşmən də təəccüb eylər.* M.Müşfiq. *Belə ağır bir mərasimdə, belə ağır fəlakət müqabilində ananın dözümünə çoxları təəccüb edirdi.* Mir Cəlal.

2. Əcaib, qəribə, təəccüblü, heyrət doğuran. *Təəccüb şeydir... –* [Harun:] *Cürətin, Zeyda, təəccübdür sənin.* Ü.Hacıbəyov.

3. **Təəccüblə** şəklində *zərf* – təəccüblü nəzərlə, heyrətlə. *Bu çəkməli kimdir belə? – deyə bəy təəccüblə soruşur.* S.Rəhimov. *Arvad təəccüblə Teymura baxıb tələsik cavab verdi.* H.Seyidbəyli.

**TƏƏCCÜBLƏNDİRMƏ** "Təəccübləndirmək"dən *f.is.*

**TƏƏCCÜBLƏNDİRMƏK** *f.* Təəccüb doğurmaq, heyrətləndirmək. *Gəncin sözləri və şəhərdə gördükləri səyyahları son dərəcə təəccübləndirdi.* Çəmənzəminli. *Aslangili kimi bir külfətdən mühəndis çıxması hamını təəccübləndirirdi.* C.Cabbarlı.

**TƏƏCCÜBLƏNMƏ** "Təəccüblənmək"dən *f.is.*

**TƏƏCCÜBLƏNMƏK** *f.* Təəccüb etmək, heyrət etmək. *Ləman əvvəl təəccübləndi, sonra gülməyini güclə saxlayıb, sərbəst bir hərəkətlə başını geri atdı, xurmayı saçları dalğalandı.* H.Seyidbəyli.

**TƏƏCCÜBLÜ** *sif.* Təəccüb doğuran, gözlənilməz, qəribə, heyrətə salan. *Təəccüblü iş. – Həkim təəccüblü* (z.) *baxır hacılara tərəf və bir şey başa düşmür.* C.Məmmədquluzadə. *Murad üçün ən təəccüblü bu idi ki, bəzi adamlar uşaqdan bezir, tənhalıq arzulayırlar.* Mir Cəlal.

**TƏƏHHÜD** *is.* [*ər.*] *köhn.* Öhdəyə götürmə; öhdəyə götürülmüş şey; öhdəlik. *Götürdüyü təəhhüdün yarısını* [Səkinə] *bir ayın ərzində yerinə yetirmişdi.* H.Seyidbəyli.

**TƏƏHHÜDNAMƏ** *is.* [*ər.* təəhhüd və *fars.* ...namə] *köhn.* Öhdəyə götürülmüş şeyin, öhdəliklərin yazıldığı sənəd.

**TƏƏLLÜQ** *is.* [*ər.*] Asılı olma, əlaqəli olma, ilişkə.

**TƏƏRRÜZ** *is.* [*ər.*] Sataşma, təcavüz etmə, hücum etmə.

**TƏƏSSÜB** *is.* [*ər.*] 1. Bir fikrə, əqidəyə, məsləkə kor-koranə bağlanıb, başqalarına kin və ədavət bəsləmə; qeyrətkeşlik, fanatizm. *Bağdad xalqının gözü qarşısında meyitlərin üç gün dar ağacında qalması ərəb təəssübünün bir daha coşmasına səbəb ola bilər.* M.S.Ordubadi.

2. Qeyrət, namus. *Həqiqi şair .. gərəkdir öz səsini millətin səsinə qoşub, onun qeyrət və təəssüb damarını hərəkətə gətirə.* F.Köçərli. [Qəmər:] [Züleyxa] *özgə qızı da olsa, yenə təəssübü sənin üstünə gələcək.* M.İbrahimov. ☐ **Təəssüb çəkmək** – qeyrət çəkmək, namusunu qorumaq.

**TƏƏSSÜBKEŞ** *is.* [*ər.* təəssüb və *fars.* ...keş] 1. Təəssüb çəkən; fanatik. *Təhmasibin yaratdığı Əbu-Übeyd son dərəcə təəssübkeş bir ərəb xadimi və islam mücahidi idi.* C.Cəfərov.

2. Qeyrət çəkən, namusunu qoruyan, qeyrətkeş. [Leylək Ələmdar:] *Göydəki bir tanrı bilir ki, mən necə təəssübkeşəm.* S.Rəhimov.

**TƏƏSSÜF** *is.* [*ər.*] 1. Kədərlənmə, acıma, heyifsilənmə, təəssüflənmə; kədər hissi. ☐ **Təəssüf etmək (eləmək)** – b a x **təəssüflənmək** 1-ci mənada. [Şeyx Hadi:] *Çarəsiz biz də Hindi tərk edərək; Geri döndük təəssüf eyləyərək.* H.Cavid. [Əkrəm:] *Təəssüf edirəm ki, sənin yazını oxuyub anlaya bilmədim.* S.Hüseyn.

2. Birisinə acıma, ona canı yanma, yazığı gəlmə. ☐ **Təəssüf etmək (eləmək)** – b a x **təəssüflənmək** 2-ci mənada.

◊ **Təəssüf ki, təəssüflər olsun ki** – heyif ki, əfsus ki. [Uğur:] *Təəssüf ki, müharibə imkan vermədi, qurtaram.* İ.Əfəndiyev. [Yaqub Aslana:] *Təəssüf ki, ailəmizi tanımırsan.* S.Vəliyev.

**TƏƏSSÜFLƏNMƏ** "Təəssüflənmək"dən *f.is.*

**TƏƏSSÜFLƏNMƏK** *f.* 1. Təəssüf etmək, kədərlənmək, heyifsilənmək. *Həmzə isə artıq, məsələni gizlətməyin lüzumsuz olduğunu düşünüb, açıqca təəssüflənirdi.* Ə.Əbülhəsən. *Kələntərli isə elə bil ki, .. cavan oğlanla axıra qədər söhbət eləyə bilmədiyinə təəssüflənirdi.* İ.Hüseynov.

2. Ürəkdən acımaq, heyifsilənmək, təəssüf etmək. *Bir çoxları qızın bağrı çatlamış olduğunu zənn edərək təəssüflənirdi.* M.S.Ordubadi.

**TƏƏSSÜR** *is.* [*ər.*] 1. Bir şeyin təsiri altında olma, təsirini hiss etmə, duyma, mütəəssir olma.

2. Hiss, təəssürat, ruhi iztirab (hiddət, qeyz, qorxu, sevinc və s.); emosiya. *Evinə çatmadan altı aydan bəri* [Qurbanlıda] *doğan hisslər və təəssürlər tamamilə silinib getdi.* Çəmənzəminli.

**TƏƏSSÜRAT** *is.* [*ər.* "təəssür" söz. cəmi] Xarici aləmdəki əşya və hadisələrin insan şüurunda buraxdığı iz, onların əksi, ona təsiri. [Nadir bəy:] *İnsanlar arasında ülfət ziyadələşdikcə, şübhəsiz, könüldəki təəssürat və məhəbbət də o nisbətdə artmağa başlar.* H.Cavid. *Axırda da Aslan öz təəssüratını nəql etdi.* M.İbrahimov.

**TƏƏŞŞÜQ** *is.* [*ər.*] Aşiq olma, qarşılıqlı sevgi.

**TƏFAVÜT** *is.* [*ər.*] İki adam və ya iki şey arasındakı fərqli cəhət; fərq. [Tarverdi:] *Fəqət yenə bilmədim ki, şeytan ilə bu Aslanın təfavütü nədədir?* C.Cabbarlı. [Qoca:] *Bizim üçün şah və gəda – təfavütü yoxdur.* A.Divanbəyoğlu. ☐ **Təfavüt qoymaq** – bir-birindən fərqləndirmək, fərq qoymaq. *Duz ilə doşaba təfavüt qoymur.* (Ata. sözü). **Təfavüt etməmək (eləməmək)** – fərqi olmamaq. [Mozalan bəy:] Sizin üçün də təfavüt eləməz. Ə.Haqverdiyev.

**TƏFCİMƏK** *f. məh.* Yamamaq, yamaq qoymaq.

**TƏFƏKKÜR** *is.* [*ər.*] 1. *fəls.* İnsanın fikirləşmək, düşünmək, nəticə çıxarmaq bacarığı; şüurun obyektiv varlığı əksetdirmə prosesində xüsusi pillə. *Elmi təfəkkür. Beyin təfəkkür orqanıdır.*

2. *klas.* Fikir. ☐ **Təfəkkür etmək (qılmaq)** – fikir etmək, fikirləşmək, düşünmək. *Məcnun dedi: – Eyləmə təfəkkür!* Füzuli.

**TƏFƏRRÜAT** [*ər.* "təfərrü" söz. cəmi] 1. Əsas mətləbə az dəxli olan təfsilat; ikinci dərəcəli əhəmiyyəti olan məsələlər, xırda məsələlər. // Bir şeyin ən kiçik, ən xırda, ən incə cəhətləri. *Bir nöqtə, kiçicik bir cizgi və təfərrüat belə yerinə düşməsə o, sənət əsərini korlaya bilər.* S.Rəhimov. *Dilbər ekskavator üstündəki görüşün bütün təfərrüatını xatırlayaraq bu fikri başından qovdu.* Ə.Sadıq.

2. **Təfərrüatla** şəklində *zərf* – incədən-incəyə, müfəssəl şəkildə, ətraflı, hərtərəfli, təfsilatla. [Rəşid:] [Bəyim xala] *cəmi-cümlətanı iki kərə mənim suallarıma bir qədər təfərrüatla cavab vermişdi*. İ.Hüseynov.

**TƏFRİQƏ** *is.* [*ər.*] 1. Narazılıq nəticəsində araya ikitirəlik düşmə; ayrılma, ayrılıq, ittifaqsızlıq, ikitirəlik. [Mirzə Heydər:] *Belə təfriqədən burjua hökumətləri isə istifadə edirlər*. Ə.Haqverdiyev. *O hələ uşaq ikən; Düşünmüş için-için;* "*Bu yollar, təfriqələr; Təriqətlər nə üçün?*" B.Vahabzadə. ☐ **Təfriqə düşmək** – ikitirəlik düşmək, ədavət düşmək, düşmənçilik düşmək. **Təfriqə salmaq** – ikitirəlik salmaq, düşmənçilik salmaq. *Saldı araya təfriqə gülçini-ruzgar; Ol gül yanında qalmadı bir etibarımız*. S.Ə.Şirvani.

2. *köhn.* Qəzet səhifəsinin ayrılmış bir yerində hissə-hissə dərc olunan hekayə, məqalə və s.

3. *köhn.* bax **vodevil**. "*Məstəli şah*"*dan sonra* "*Könülsüz*" *ünvanında bir pərdədə tərtib olunmuş təfriqə* (*vodevil*) *oynandı.* F.Köçərli.

**TƏFRİQƏÇİ** *is.* Bir təşkilata təfriqə salan, ikitirəlik salan, onun vəhdətinin pozulmasına, onun parçalanmasına səbəb olan adam.

**TƏFRİQƏÇİLİK** *is.* Təşkilatda, partiyada və s.-də təfriqə salma, onun vəhdətini pozma, təfriqəçinin gördüyü pozuculuq işi; ikitirəlik. *Təfriqəçiliklə mübarizə.*

**TƏFSİL** *is.* [*ər.*] bax **təfsilat**. *Qurşaq da, bilirsən ki, on arşın gərək olsun; Təfsilə nə hacət.* M.Ə.Sabir. *Macəranın təfsilini, inşallah, özüm gələndə dilcavabı nəql elərəm*. C.Məmmədquluzadə.

**TƏFSİLAT** *is.* [*ər.* "təfsil" söz. cəmi] 1. Bir işin, hadisənin və s.-nin ən kiçik, ən cüzi təfərrüatı. *Məsələnin təfsilatı*. – [Fərman] *..qızla olan ilk görüşünün təfsilatını xəyalında canlandırdı*. Ə.Sadıq. *Verdiyev* [Gəldiyevi] *yaxşı başa düşür, söhbətinin təfsilatını da bilirdi.* Mir Cəlal.

2. **Təfsilatla** şəklində *zərf* – müfəssəl surətdə, təfsilən. *Mürsəl kişi olub-keçənləri təfsilatla yazmışdı*. M.Hüseyn.

**TƏFSİLƏN** *zərf* [*ər.*] Təfərrüatı ilə, təfsilatı ilə, müfəssəl surətdə. *Şeyx əyləşəndən sonra Məmməd əhvalatı başdan-ayağadək təfsilən nəql elədi.* E.Sultanov. [Vəkillər] *kəndlilərin adlarını, acların sayını və istədikləri pulun qədərini adbaad, kəndbəkənd hamısını təfsilən yazıb, yekə-yekə kitablar bağlamışdılar.* C.Məmmədquluzadə.

**TƏFSİLLİ** *sif.* Müfəssəl, təfsilatla, təfsilən. *Əsər çox təfsilli yazılmışdı*. M.S.Ordubadi.

**TƏFSİR** *is.* [*ər.*] Şərh, izah; şərh və bəyan etmə, izah etmə. ☐ **Təfsir etmək** – izah etmək, şərh etmək. [Murad] *bəzi cümlələrin üzərində uzun-uzadı düşünür, özlüyündə onları təfsir edirdi*. S.Hüseyn.

**TƏFSİRÇİ** *is.* Hər hansı bir əsəri şərh və bəyan edən, izahını verən şəxs; şərhçi.

**TƏFTİŞ** *is.* [*ər.*] 1. İşlərin düzgünlüyünü və qanuni olub-olmadığını yoxlamaq məqsədilə hər hansı idarə və ya vəzifəli şəxsin fəaliyyətinin təhqiq edilməsi, yoxlanması. *Bürcəliyev açılmış qapıdan təftiş heyəti işləyən otağı dinlədi.* S.Rəhimov. [Yusif Həsrətə:] *Təftiş komisyonunun sədri fağırın biridir*. B.Bayramov. ☐ **Təftiş etmək** – yoxlamaq, yoxlama aparmaq, təhqiqat aparmaq. [Qarovul] *..diqqətli bir surətdə malların hamısını təftiş etməyə başladı*. B.Talıblı. [Hümmət aqronoma:] *Bura köməyə gəlmisiniz, ya təftiş eləməyə?* B.Bayramov.

2. Hər hansı dünyagörüşünün və ya nəzəriyyənin əsasını sarsıtmaq və ya təhrif etmək məqsədilə onun müddəalarını nəzərdən keçirmə.

**TƏFTİŞÇİ** *is.* Təftişçilik tərəfdarı, təftişçiliklə məşğul olan adam.

**TƏFTİŞÇİLİK** *is.* 1. İnqilabi marksizmin siyasi, fəlsəfi və iqtisadi əsaslarını təftiş etmək, yenidən nəzərdən keçirmək və ya təhrif etmək, onları kapitalizmin xeyrinə, sosialist inqilabının və proletar diktaturasının zərərinə olaraq dəyişmək məqsədini güdən məfkurəvi-siyasi cərəyan.

2. Hər hansı bir dünyagörüşünü, nəzəriyyəni təftiş edən cərəyan.

**TƏĞYİR** *is.* [*ər.*] Dəyişmə, dəyişiklik, dəyişdirmə, başqalaşma. *Balalar müəllimdə zühur edən təğyiri düşündülər və hamısının üzündə məyusluq əsəri göründü.* Çəmənzəminli. ☐ **Təğyir etmək (tapmaq, vermək)** – dəyişmək, dəyişilmək. [Yusif:] *On ildir ki, Şamdan ilə görüşməmişəm. İndi gərək ki, surəti də təğyir tapıbdır*. N.Nərimanov. *Namazı qurtarıb* [Xudayar bəy] *üzünü tutdu Vəliquluya, amma surətinə təğyir vermədi.* C.Məmmədquluzadə.

**TƏHARƏT** *is.* [*ər.*] Təmizlik, paklıq.

**TƏHDİD** *is.* [*ər.*] Qorxutma, hədələmə; hədə, qorxu, hədə-qorxu. *Aslan bəy təhqir və təhdidin bu qədərinə dayana bilmədi.* A.Şaiq. *..Mürtəcelər fitnəkarlıq və təhdidə əl atırdılar.* M.İbrahimov. ☐ **Təhdid etmək** – hədələmək, hədə-qorxu gəlmək, qorxutmaq. [Sara Bəhrama:] *Hərgah səni bu evdən qovmaqla təhdid edərlərsə, eybi yoxdur.* C.Cabbarlı. *Qətibə Toğrulun danışdıqlarına çox böyük əhəmiyyət verdi, çünki bu sözlərlə Toğrulun onu təhdid etdiyini anlayırdı*. M.S.Ordubadi.

**TƏHDİDEDİCİ, TƏHDİDLİ** *sif.* Hədələyici, təhdid edən, hədələyən. *Qaçaqların bu təhdidedici sözlərinə yolçuların anlamadığı şeylər də qarışırdı.* Mir Cəlal.

**TƏHƏMMÜL** *is.* [*ər.*] *klas.* Səbir etmə, dözmə, qatlaşma. [İsmət:] *Lakin təhəmmüldən başqa çarə nə?* H.Cavid. ☐ **Təhəmmül etmək** – səbir etmək, dözmək, qatlaşmaq. *Seyyid, təhəmmül et təbi-hicranə, çəkmə ah.* S.Ə.Şirvani.

**TƏHƏR** [*ər.* tövr-dən] 1. *is.* Cür, üsul, qayda, yol. *Nə təhər adamdır? Bu təhər hərəkət etmək olmaz*. – [At] *dilə gəlib dedi: – Padşah bir uzun örkən, bir də poladdan bir bıçaq qayıtdırsın, sonra mən sənə təhərini deyərəm.* (Nağıl). ☐ **Təhərini bilmək** – qaydasını, yolunu bilmək, necə hərəkət edəcəyini bilmək. *..Tacirlərə yanaşmağın təhərini bilmək lazımdır*. M.S.Ordubadi. [Hümmət Qarakişiyə:] [Yusif] *elə ki işləmədi, onda təhərini bilirəm.* B.Bayramov. **Bu təhər** – bu qayda ilə, bu yolla, bu cür, beləliklə. *Bu təhər Şaqqulu sabahı gün qızı görüb aşıqladı və səbirsiz toyu gözləyirdi.* Çəmənzəminli.

2. *qoş.* Kimi, bənzər, oxşar. *Atası təhəri hündürboydur. – Qoca usta yerindəcə doğrulub Paşanı qucaqlayanda Nisa təhəri ağlamadı.* M.Hüseyn.

3. B a x **təhər-töhür**.

4. *is. dan.* İmkan, həvəs, arzu. *Onlara getməyə təhərim yoxdur. – Varsa qaçaqların əgər təhəri; Kəssinlər hər yandan əyri yolları.* H.K.Sanılı.

**...təhər** mürəkkəb sifətlərin ikinci tərkib hissəsi olub təxminlik bildirir – ...kimi, azacıq..., bir az... *Qırmızıtəhər rəng. Acıtəhər dad. – Bu hibridin meyvələri şirin və bir qədər turştəhər olub çox dadlıdır.* M.Axundov.

◊ **Təhər çəkmək** – yoluna qoymaq, həll etmək, tədbir görmək, çarə çəkmək, əncam çəkmək. [Sərvər:] *..Sən atana deyinən ki, özün bilərsən. Sonra sənin işin yoxdur. Mən bu işə təhər çəkmişəm*. Ü.Hacıbəyov. [Safo:] *Alo əmi, Allah bu işlərə təhər çəkməyəcəkdir*. S.Rəhimov. **Təhərdən çıxarmaq** – xarab etmək, korlamaq. [Münəvvər xanım Rzaqulu xana:] *Cəmi təqsirlər səndədir ki, ayda yüz tümən pul verib, uşaqları təhərdən çıxarırsan.* M.S.Ordubadi. **Təhərdən çıxmaq** – adi, təbii görkəmini itirmək, pis şəklə düşmək, xarab olmaq. *Minlərcə biletsiz sərnişinlərin şinellərində gətirdiyi tozdan və çəkmələrindəki palçıqdan pilləkənlər, göyərtələr təhərdən və şəkildən çıxmışdı*. Ə.Əbülhəsən. **Təhərə düşmək** – normal şəklə düşmək, adi, təbii halını almaq, qaydaya düşmək. **Təhərə salmaq** – normal şəklə salmaq, adi, təbii halına salmaq, qaydaya salmaq. **Təhərim yoxdur** – istəmirəm. *Qonaqların yanında qızarmağa təhərim yoxdur*. Mir Cəlal. **Təhərini pozmadan** – təbii halını pozmadan, etidalını pozmadan, həmişə olduğu kimi, həmişəki kimi. *Ataş təhərini pozmadan cavab verdi.* Ə.Vəliyev. *Aslan təhərini pozmadan gülümsündü*. S.Vəliyev. **Bir təhər olmaq** – b a x **bir**.

**TƏHƏRSİZ** *sif.* Biçimsiz, xarici görünüşü pis, eybəcər, yaraşıqsız.

**TƏHƏR-TÖHÜR** *is.* Xarici görünüş, görkəm (çox vaxt istehza, mənfilik çaları ilə). *Bunun təhər-töhürünə baxın. – Təhər-töhüründən*

*mollaya oxşayan qoca bir kişi isə adamların siyahısını tuturdu*. Ə.Abasov.

**TƏHƏSSÜR** *is.* [*ər.*] *köhn.* Həsrət çəkmə, həsrətində olma.

**TƏHƏVVÜL** *is.* [*ər.*] *köhn.* Haldan-hala keçmə, başqa hala keçmə, dəyişmə.

**TƏHƏYYÜR** *is.* [*ər.*] *köhn.* Heyran olma, heyrətə düşmə, heyrətə gəlmə, mat qalma, matı-mutu quruma.

**TƏHKİM** *is.* [*ər.*] (əsasən "etmək", "edilmək", "olmaq", "olunmaq" köməkçi feilləri ilə işlənir). 1. Birinin sərəncamına, ixtiyarına vermə (məşğələ keçmək, öyrətmək, xidmət etmək və s. üçün), birinin üzərinə bu və ya başqa vəzifə qoyma. *Geri qalan şagirdləri əlaçılara təhkim etmək. – Azərbaycan qadınları arasında işləmək üçün firqə* [Məsməni] *çalışmaqda olduğu arteldən alıb, qadınlar şöbəsinə təhkim edir*. S.Hüseyn. [Firəngiz:] *Ancaq aranızda olan ferma, yaylaq işçiləri, yaxşı olar ki, ..təhkim olunduğu fermaya getsin*(*lər*). B.Bayramov.

2. Hər hansı bir məqsədlə, yaxud xidmət və ya istifadə üçün bir yerə qeyd olunma (etmə). *Pəhriz yeməkxanasına təhkim olunmaq.*

**TƏHKİMÇİ[1]** *is. tar.* Rusiyada təhkimçilik ictimai quruluşunda: təhkimçilik hüququna malik olan mülkədar.

**TƏHKİMÇİ[2]** *is.* Təhkim olunmuş, təhkim edilmiş adam (b a x **təhkim** 1-ci mənada). *Bir də yeddi nəfərlik köməkçilər heyəti; Bir də məsul təhkimçi qeyd edildi nəhayət.* R.Rza. [Nuriyyə:] *Səriyyə əvvəlcə məni mərkəzdən gəlmiş təhkimçi hesab etdi.* İ.Əfəndiyev.

**TƏHKİMÇİLİK** *is. tar.* Mülkədarların, onlara məxsus olan kəndlilərin əməyinə, malına, canına tam sahib olduqları ictimai quruluş; krepostnoyluq. *Təhkimçilik dövrü. Təhkimçilik münasibətləri. Təhkimçilik təsərrüfatı.* ◻ **Təhkimçilik hüququ** *tar.* – mülkədarlara, onlara məxsus olan kəndlilərin şəxsiyyəti, əməyi və əmlakı üzərində tam ağalıq etmək ixtiyarı verən hüquq.

**TƏHKİMLİ** *is. tar.* Təhkimçilik ictimai quruluşunda: təhkimçilik hüququna əsasən mülkədara məxsus olan kəndli. // Sif. mənasında. *Təhkimli kəndli. – Hanı ömrü nəhayətsiz əzablar içərisində keçmiş təhkimli mujiklər?* M.İbrahimov.

**TƏHKİYƏ** *is.* [*ər.*] *ədəb.* Bədii əsərin, təsvir və mükalimədən fərqli olan, hərəkət, iş, hadisə haqqında izahdan ibarət hissəsi.

**TƏHQİQ** *is.* [*ər.*] Həqiqəti üzə çıxarmaq, bir şeyin düzgün olub-olmadığını müəyyən etmək məqsədilə araşdırma; təhqiqat (əsasən "etmək" və "olmaq" köməkçi feilləri ilə işlənir). *Bir neçə gündən sonra Kamil .. işin təzədən təhqiq edilməsini tələb etdi.* C.Cabbarlı. [Vəzir:] *Olmazmı ki, sizin əvəzinizə mən gedim, bu işi yerində təhqiq edim?* Ü.Hacıbəyov.

**TƏHQİQAT** *is.* [*ər.* "təhqiq" söz. cəmi] Təhqiq etmə, araşdırma, yoxlama. *Məhkəmə təhqiqatı*. – [Şərif Almaza:] *Orası bizə də, kəndimizə gələn təhqiqat* [komissiyasına] *da məlumdur*. C.Cabbarlı. ◻ **Təhqiqat aparmaq** – həqiqəti ortaya çıxarmaq üçün təhqiq etmək, araşdırmaq, yoxlamaq.

**TƏHQİQATÇI** *is.* Təhqiqat aparan rəsmi şəxs.

**TƏHQİR** *is.* [*ər.*] Heysiyyətini alçaltma, mənliyinə toxunma, şərəfsiz etmə; həqarət, alçalma, alçaltma. [Xəyyam:] *Xəyyamə nə lazımdı ki, zəncir; Onsuz da köləndir, bu nə təhqir?* H.Cavid. [Qulu:] *Mən belə təhqirlərə dözə bilmərəm.* İ.Əfəndiyev. ◻ **Təhqir etmək** – heysiyyətini alçaltmaq, mənliyinə toxunmaq, şərəfsiz etmək, alçaltmaq. [Gəray:] *Məni Nüşabə eylədi təhqir; Tökürəm intiqam üçün tədbir.* A.Şaiq. *Onlar təhqir etmədi; Sən təhqir etdin onu.* B.Vahabzadə.

**TƏHQİRAMİZ** [*ər.* təhqir və *fars.* ...amiz] b a x **təhqiredici**. *Qonşunun təhqiramiz sözü yenə Güldəstənin yadına düşdü.* Çəmənzəminli.

**TƏHQİRANƏ** [*ər.* təhqir və *fars.* ...anə] b a x **təhqiredici**. [Zəhra] *Həsənin ona əl qaldırmasını və təhqiranə sözlərini heç cür unuda bilmirdi.* M.İbrahimov.

**TƏHQİREDİCİ, TƏHQİRLİ** *sif.* Heysiyyəti alçaldan, mənliyinə toxunan, təhqir edən; təhqiramiz, təhqiranə. *Təhqiredici söz. – Xan şahın bu təhqirli məktubundan sınmadı*. Çəmənzəminli. [Bəndalının anası] *ona təhqirli* (z.) *baxır*. Mir Cəlal.

**TƏHLİL** *is.* [*ər.*] 1. Tamı, bütövü tərkib hissələrinə, tərkib ünsürlərinə ayırmaqdan ibarət elmi tədqiqat üsulu (*tərkib* əksi). // B a x **analiz**. *Kimyəvi təhlil. Qanın təhlili.*

2. Bir şeyi gözdən keçirmə, araşdırma, tədqiq etmə. *Tənqidi təhlil. – Midhət əfəndi Bəyazid meydanı ilə gedərkən Türkiyənin keçirdiyi macəranın təhlili ilə məşğul idi*. Çəmənzəminli.

3. *qram.* Tərkibini, quruluşunu müəyyənləşdirmə. *Cümlənin morfoloji təhlili. Sözün fonetik təhlili.*

**TƏHLÜKƏ** *is.* [*ər.*] 1. Qorxu törədən hal; xətər, xətərli iş. *Özünü təhlükəyə atmaq.*

2. Xoşagəlməz, qorxulu, ağır bir hadisənin baş vermək ehtimalı. *Hər yerdə müharibə təhlükəsindən böyük nifrət və həyəcanla danışırlar.* M.İbrahimov.

**TƏHLÜKƏLİ** *sif.* Təhlükəsi olan, həyat üçün qorxusu olan; xətərli, qorxulu. *Təhlükəli vəziyyət. Təhlükəli iş. Təhlükəli yol. – Parovozlar isə təhlükəli dairədən qatarları çəkərək uzağa apardı*. Ə.Sadıq. // Fəlakətlə, uğursuzluqla nəticələnə bilən. *Təhlükəli siyasət. Təhlükəli başlanğıc*. – [Səlim və Məryəm] *ayrılığa dözə bilmir, çox təhlükəli addım atırdılar.* İ.Qasımov.

**TƏHLÜKƏSİZ** *sif.* Heç bir təhlükəsi, qorxusu olmayan; xətərsiz. *Təhlükəsiz vəziyyət. – Su yolu dəmir yoldan daha təhlükəsiz və nisbətən etibarlı idi.* A.Şaiq.

**TƏHLÜKƏSİZLİK** *is.* Heç bir təhlükə olmadığı hal, vəziyyət, şərait. *Beynəlxalq təhlükəsizlik. Yol hərəkəti təhlükəsizliyi.* ☐ **Təhlükəsizlik texnikası** – iş şəraitinin təhlükəsizliyini təmin edən əmək vasitələri və üsulları sistemi. [Cəmil] *özü də ilk dəfə bura gələndə fəhlələrdən biri onu təhlükəsizlik texnikalarının ən zəruri tələbləri ilə tanış eləmişdi.* M.Hüseyn.

**TƏHR** *dan.* b a x **təhər**. [Alo:] *İndi, arvad, təhrimiz ancaq səbir eləməkdir!* S.Rəhimov. [Şirzad:] *Ay Salman, böyük bir kolxozun mühasibisən, neçə yerdə oxumusan, neçə kurs qurtarmısan, yenə də adamla danışmağın təhrini bilmirsən.* M.İbrahimov.

**TƏHRİF** *is.* [*ər.*] Bir sözün, ifadənin hərflərini dəyişdirməklə mənasını, mahiyyətini pozma, yanlış şəklə salma. ☐ **Təhrif etmək** – dəyişərək nöqsanlı etmək, korlamaq, yanlış şəklə salmaq. *Fikri təhrif etmək. Əsərin məzmununu təhrif etmək. – Romançılıq bəzi tarixi həqiqətləri də təhrif edir.* M.S.Ordubadi.

**TƏHRİK** *is.* [*ər.*] Sözlə və ya başqa şirnikləndirici vasitələrlə birini bir iş görməyə vadar etmə, sövq etmə, meyilləndirmə, həvəsləndirmə. [Kitabpaylayan:] *Sonra eşitdim ki, bir mollanın təhrikinə görə gəlib, məndən kitabları alıb, aparıb odluyublar.* Ə.Haqverdiyev. ☐ **Təhrik etmək** – 1) bir iş görməyə həvəsləndirmək, sövq etmək. [M.F.Axundzadəni] *yazıçılığa təhrik edən də bədii zövqündən daha artıq ictimai məfkurələri idi.* C.Cabbarlı; 2) pis bir işə sövq etmək, həvəsləndirmək. *Oğurluğa təhrik etmək. Cinayətə təhrik etmək.*

**TƏHRİKÇİ** *is.* Təhrik edən, həvəsləndirən, sövq edən adam (pis işə).

**TƏHRİKEDİCİ** *sif.* Təhrik edən, həvəsləndirən, sövq edən (adətən pis işə).

**TƏHRİR** *is.* [*ər.*] *klas.* Yazma, yazı; qələmə alma. // Yazılmış, yazılı şeir, kitab və s. *Cəhd edin, göndərdiyim təhrirlər puç olmasın!* M.Ə.Sabir. ☐ **Təhrir etmək (qılmaq)** *klas.* – yazmaq, qələmə almaq. *Təhrir qılıb münasibihal; Bu şeri həm etdi ona irsal.* Füzuli. *Gəlməyimdə əgərçi var təxir; Edirəm mən risaləmi təhrir.* S.Ə.Şirvani.

**TƏHRİRİ** *sif.* və *zərf* [*ər.*] Yazılı, yazılmış surətdə (*şifahi* əksi). *Təhriri cavab. Təhriri surətdə. – Dəmirov yol barəsində tərtib etdiyi təhriri məruzəni çıxarıb, yenə sədrə təqdim etdi.* S.Rəhimov. *Katib Cəmilin yazdığı təhriri məlumata bir də nəzər salıb başını qaldırdı.* Q.İlkin. // Zərf mənasında. *Təhriri danışmaq.*

**TƏHSİL** *is.* [*ər.*] 1. Oxumaqla elm və bilik əldə etmə. *Bir neçə ildən sonra Yusif Sərrac təhsili-elm üçün İsfahana getdi.* M.F.Axundzadə.

2. Oxumaq nəticəsində əldə edilən biliklərin məcmusu. *Orta təhsil. Uşaqlara təhsil vermək. Xüsusi təhsil.* – [Qaraş Mayaya:] *Mənim sənə görə təhsilim azdır.* M.İbrahimov.

**TƏHSİLLİ** *sif.* Təhsil almış, oxumuş, bilikli. *Yoldaşların ikisi də ali təhsillidirlər.* Ə.Vəliyev.

**TƏHSİLSİZ** *sif.* Heç bir təhsil görməmiş; oxumamış.

**TƏHSİLSİZLİK** *is.* Təhsil görməmiş, oxumamış adamın halı.

**TƏHSİN** *is.* [*ər.*] Bir işi və ya şeyi bəyənib tərifləmə, alqışlama; təqdir, tərif. *Malikin sözlərini* [kəndlilər] *diqqətlə təhsin səsləri ilə dinləyirdilər*. M.İbrahimov. [Buğac] *atasının təhsin və təqdirini qazanacaqdı...* M.Rzaquluzadə. □ **Təhsin etmək** – bəyənərək tərifləmək, təqdir etmək, alqışlamaq. *Hürriyyətpərəst müsəlmanlar millət bahadırı Səttarxanı tərif və təhsin edirlər*. F.Köçərli.

**TƏHT** *is.* [*ər.*] Adətən **təhtində** şəklində – altında, hakimiyyəti, idarəsi altında, tabeiyyətində, tabeliyində. [Vaqif:] [Fətəlinin] *təhtindəki yerlərin də yönü Dərbəndə tərəfdir, bir iş olsa beli* [Rusiyaya] *bağlıdır*. Çəmənzəminli. // *köhn.* Eyni mənada izafət birləşmələrinin birinci tərkib hissəsi şəklində işlənir. *Səməd valideyninin təhti-nəzarətindən qurtarıb, avara gəzməyə daha da meydan vermişdi*. Çəmənzəminli. *Qazax mahalından bir neçə elat köçüb Qarabağ vilayətinə, İbrahim xanın təhti-himayətinə gediblər*. F.Köçərli.

**TƏHTƏLHESAB** *is.* və *sif.* [*ər.*] Sonradan haqq-hesab vermək şərtilə alınan pul. *Təhtəlhesab pul almaq*.

**TƏHVİL** *is.* [*ər.*] (adətən "almaq", "etmək" köməkçi feilləri ilə işlənir) 1. Təzə işə keçərkən və ya işdən çıxarkən tapşırılmış işi, vəzifəni, şeyi başqa adama vermə. [Nüsrət:] *Toğrul, sən işləri təhvil al!* C.Cabbarlı. *Beş gündən sonra Tərlanov işi təhvil verib, Teymuru yanına çağırdı.* H.Seyidbəyli. // Öz əməyinin nəticəsini, məhsulunu istifadə olunmaq üçün lazımi yerə və ya şəxsə vermə. [Əmrulla:] [Qüdrət] *pyesi qurtarıbdır, gətirdi təhvil versin.* C.Cabbarlı. [Yusif Həsrətə:] *O barədə işimiz pis deyil. Şahmar taxıl təhvilində iştirak eləyir.* B.Bayramov.

2. Hicri-şəmsi təqvimində köhnə ilin qurtarıb yeni ilin daxil olması. [Əliməmməd Vaqifə:] *..Hələ il təhvil olmamışdır, dəstəyə bir saat qalanda olacaq*. Çəmənzəminli. *Təbil və şeypur səsləri ilin təhvil olduğunu Təbriz xalqına bildirdi.* M.S.Ordubadi.

**TƏHVİLÇİ** *is.* Bir şey təhvil verən adam.

**TƏXƏLLÜS** *is.* [*ər.*] Adətən yazıçıların, rəssamların və b.-nın işlətdikləri qondarma ad. *Az bir zamanda onun böyük şair olub Nəsimi təxəllüsü daşıdığı şəhərə yayıldı.* Çəmənzəminli.

**TƏXƏLLÜSLÜ** *sif.* Təxəllüsü olan, təxəllüslə yazan. "*Füyuzat*"*ın 24-cü nömrəsində, axırıncı səhifədə* "*Azad*" *təxəllüslü şair üzünü xanımlara tutub* [deyir].. C.Məmmədquluzadə.

**TƏXƏRRÜŞ** *is.* [*ər.*] Xarici mühitin, bir şeyin (səs və s.-nin) orqanizmə və ya onun bir hissəsinə təsiri nəticəsində əmələ gələn hal; qıcıqlanma, qıcıq. □ **Təxərrüşə gəlmək** – qıcıqlanmaq. [Əsgər:] *Birdən onlara yox, bizimkilərə dəydi, – deyə, düşünərək təxərrüşə gəlmiş əsəblərini sakit eləməyə başladı.* M.Hüseyn. **Təxərrüşə gətirmək** – qıcıqlandırmaq. *Spirt mədə şirəsinə qarışıb onun tərkibini dəyişdirir, selik qişasını təxərrüşə gətirib, iltihab, yara və mədə xərçəngi kimi xəstəliklər törədir.*

**TƏXƏYYÜL** *is.* [*ər.*] Bir adamı və ya bir şeyi zehnində, xəyalında təsəvvürə gətirmə, canlandırma; xəyala, xəyalata qapılma. // Xəyal, xülya, xəyalat. *Rüxsarə o qədər təxəyyül aləminə qapılmışdı ki, elə bil lap salonda əyləşmişdi.* S.Rəhimov. // Yaradıcılıq fantaziyası.

**TƏXFİF** *is.* [*ər.*] 1. Sözün müəyyən hissəsinin ixtisarı.

2. Asanlaşdırma.

3. Azaldılma.

**TƏXİR** *is.* [*ər.*] Yubanma, gecikmə, ləngimə. *..Məktub sahibi gəldi idarəyə və ruznamənin təxirindən başladı giley eləməyə.* C.Məmmədquluzadə. □ **Təxir etmək** – yubatmaq, gecikdirmək, ləngitmək, sonraya saxlamaq (keçirmək). [Mələkə:] *Zənn edirəm ki, hökmdar mənim bu arzumu yerinə yetirməkdə təxir və tərəddüd etməyəcəkdir.* M.S.Ordubadi. **Təxirə düşmək** – yubanmaq, gecikmək, ləngimək. *..Azərbaycan nümayəndələri yubandığı üçün bu iş bir az təxirə düşmüşdü.* M.S.Ordubadi. **Təxirə salmaq** – yubatmaq, gecikdirmək, ləngitmək, sonraya qoymaq. [Sədr:] *Hələlik tədbir görülməni təxirə salmaq tərəfdarları əllərini qaldırsın.* Çəmənzəminli. [Cavanşir:] *Biz hücumu təxirə sala bilmərik*. M.Hüseyn.

**TƏXİRƏSALINMAZ** *sif.* Təxirə salına bilməyən, yubadıla bilməyən, gecikdirilə bilməyən; təcili. *Təxirəsalınmaz vəzifə*. – [Həkimin] *elə bil çox tələsik, təxirəsalınmaz işi var..* H.Seyidbəyli.

**TƏXLİYYƏ** *is.* [*ər.*] *köhn.* Boşaltma, boşaldılma.

**TƏXMİN** *is.* [*ər.*] Güman, zənn, ehtimal. *Bu söhbətdən bir az sonra* [Məşədinin] *təxmini düz çıxdı*. M.Hüseyn. ☐ **Təxmin etmək** – güman etmək, zənn etmək, ehtimal etmək. [Hidayət] *əhvalatın nə yerdə olduğunu təxmin edirdi*. B.Bayramov.

**TƏXMİNƏN** *zərf* [*ər.*] Bir qədər az və ya bir qədər çox, bir az tez və ya bir az gec və s.; təqribən (əsasən say və rəqəmlərdən, ölçü və vaxt adı bildirən sözlərdən əvvəl işlədilir). *Təxminən yanvar-fevral aylarında. – Bu kəndlərin meyvə bağları təxminən 12-13 kvadrat kilometr yer tutaraq uzaqdan baxdıqda böyük bir meşəyə bənzəyirdi*. S.S.Axundov. *Dilbərin tikintiyə getməsindən təxminən iki həftə sonra bir gün axşam Həcər qarının ailəsinin üzvləri evə yığışmışdılar*. Ə.Sadıq.

**TƏXMİNİ** *sif.* [*ər.*] Həqiqətə az və ya çox dərəcədə yaxın olan; təqribi. *Təxmini plan. – Rəis lülələnmiş bir kağız gətirib açdı. Bu, tikinti sahəsinin təxmini xəritəsi idi*. Mir Cəlal.

**TƏXRİBAT** *is.* [*ər.* "təxrib" söz. cəmi] 1. Müharibə, təbii fəlakət və s. nəticəsində dağıntı. *Zəlzələnin törətdiyi təxribat. – ..Vətəndaş müharibəsi zamanından qalan təxribatın cansıxıcı əsərləri gözə çarpırdı*. H.Nəzərli. [Dünya] *müharibəsi öz təxribatını get-gedə artırır, işlər cığırından çıxır, pozulur, dağılırdı*. Qantəmir.

2. Xarici dövlət və sinfi düşmən təşkilatları agentinin (və ya agentlərinin) yanğın, partlayış və s. şəklində törətdikləri pozuculuq işi.

**TƏXRİBATÇI** *is.* Təxribatçılıqla məşğul olan adam.

**TƏXRİBATÇILIQ** *is.* Hər hansı ölkədə xarici dövlətin casusları tərəfindən ziyankarlıq məqsədilə hərbi və dövlət əhəmiyyətli obyektlərin dağıdılması, sıradan çıxarılması. *Düşmən casuslarının təxribatçılığı*.

**TƏXSİS** *is.* [*ər.*]: **təxsis etmək** – müəyyən məqsəd üçün ayırmaq. [Xəlil:] *Mənim anlayışımca, on manat təxsis etməli və növbə ilə yemək daşımağa adam təyin etməli*. Çəmənzəminli. [Məlikşah:] *Məmləkətin gözəl bir tərəfində ona malikanə verəcəyəm, böyük və təminedici maaş təxsis edəcəyəm*. M.S.Ordubadi. **Təxsis olunmaq** – müəyyən edilmək, ayrılmaq. *Otaqların biri qadınlara, ikisi də kişilərə təxsis olunub*. Çəmənzəminli.

**TƏXSİSAT** *is.* [*ər.* "təxsis" söz. cəmi] 1. Bir iş üçün ayrılan pul.

2. Pul və ya natural şəkildə qaytarılmaq şərtilə verilən borc (pul, şey və s.). *Pul təxsisatı. Təxsisat buraxmaq*. – [Şah:] *Arandan Darüssəlamın beytülmalına göndərilməyən dördillik təxsisat göndərilməlidir*. M.S.Ordubadi.

**TƏXT** b a x **taxt**. *..Səfəviyyə nəslindən bir şahzadəni təxtə oturdaq ki, barı nəcabətinə görə təxt və taca səzavar olsun!* M.F.Axundzadə. *Məşədi Həsən gedəndən sonra uzandım təxtin üstünə*. Ə.Haqverdiyev.

**TƏK**[1] 1. *say*. Təkcə, bircə, bir, ancaq bir, yeganə. *İki bacının tək qardaşı. Tək övlad. – Bütün evin lampaları kimi, bu axşam həyatin bu tək fənəri də yandırılmamışdı*. Ə.Əbülhəsən. ☐ **Tək ədəd** *riyaz.* – qalıqsız ikiyə bölünməyən ədəd (*cüt* əksi).

2. *sif.* Qoşa bədən üzvlərindən hər biri (əsasən o biri üzv şikəst olduqda işlənilir). *Xosrovun tək gözü təlaş içində parıldayır, o, qardaşı Sultanı arzulayırdı*. S.Rəhimov. *Xanmuradov məmnun halda tək əlini* [Rəhimin] *çiyninə qoydu*. Ə.Sadıq.

3. *sif.* və *zərf* Köməksiz, arxasız, yalnız, yalqız. [Hüseyn:] *O məni qoymadı döyüşlərdə tək; Dalımca yönəldi o böyük ürək*. M.Rahim. [Səməndər] *Nərgizi selə-suya tək buraxmaq istəmirdi*. B.Bayramov.

4. *zərf* və *sif.* Ancaq, yalnız, yalqız, təkcə, başqaları olmadan, təkbaşına. *Tək qalmaq. – Gülpəri yaxşı bilirdi ki, .. Hacı Nəsirin cəmi mal və dövləti tək Nurəddinə qalacaqdır*. S.S.Axundov. *Poladzadə kabinetində tək oturmuşdu*. Ə.Vəliyev.

5. "Ancaq", "yalnız", "təkcə" mənasında. *Ölən-qalanın dərdinə qalan həkimin nəinki tək bu kənd üçün, hətta bütün Qubadlı nahiyəsi üçün bir sehr olduğu da təəccüblü deyildi*. S.Rəhimov. [Müəllim] *tək uşaqlara savad öyrətməklə kifayətlənmirdi*. S.Qədirzadə.

6. Bənzərlik, oxşarlıq bildirir: ...kimi. *Onuntək. Sənintək. – Qəm-qüssəm başımdan aşıb; Məntək dərdə qalan yoxdu*. "Koroğlu". [Xurşid:] *Könlümdəki yaram da; Qızılgültək açıldı*. Ü.Hacıbəyov.

◊ **Tək əldən səs çıxmaz** – bir adam işin öhdəsindən gələ bilməz, tək adam heç bir şey edə bilməz. [Məcid əfəndi Musaya:] *İş çox deyil, fəqət tək əldən səs çıxmaz*. H.Cavid. **Tək günü** – salı, çərşənbə axşamı. *Çərşənbə, şənbə və tək günü qəbiristana və hamama getmək olmaz*. C.Məmmədquluzadə. **Üç cüt bir tək** – çox az şey haqqında.

**TƏK**[2] *is.* Dib. *Mən cəhənnəmə daxil olanda haman quyunun təkindən "vay, dədəm vay" naləsi eşitdim.* Ə.Haqverdiyev. *Divar kimi dik təpədən göz işlədikcə baxırsan, dərənin təki görünmür*. Mir Cəlal. // Dərinlik, alt. *Torpağımın təkində nələr, nələr yox idi; Muğanımda, Milimdə nə xəzinələr yox idi*. R.Rza. *Yerin təkində bəzi mədənlər bir-birindən ayrı halda yerləşmir*. M.Qaşqay.

**TƏK**[3] Cümlədə adətən feildən sonra gələrək, haqqında danışılan işin dərhal baş verdiyini bildirir: ...kimi. *O, gələn tək sakitlik düşdü*. – [Xortdan:] *Yay qurtaran tək .. taxılı döydürüb, satıb .. qumar borclarına veriblər*. Ə.Haqverdiyev. *Yuvasından qara böcək; Çölə çıxdı yaz gələn tək*. M.Dilbazi.

**TƏKADAMLIQ** b a x **biradamlıq**. *Təkadamlıq kamera*.

**TƏKALLAHLILIQ** b a x **monoteizm**.

**TƏKALTI** *is.* Yəhərin altından atın belinə qoyulan, üstü dəri, qalın astarlı yumşaq keçə parçası.

**TƏKAMÜL** *is.* [*ər.*] 1. Bir şəxsin, bir şeyin təkmilliyə doğru dəyişməsi, inkişafı; kamilləşmə. // Ümümiyyətlə, inkişaf, dəyişmə, yeniləşmə. *Ehtiyac təkamülün babasıdır.* (Ata. sözü). [Rasim Yavərə:] *Siz razılaşın ki, hər şey kimi musiqi də təkamülə möhtacdır.* M.İbrahimov. ☐ **Təkamül etmək** – yavaş-yavaş inkişaf etmək, dəyişmək, yeniləşmək, təkmilləşmək, kamilləşmək.

2. *fəls*. Təbiətdə və cəmiyyətdə hərəkət formalarından biri – inqilabi dəyişmədən fərqli olaraq, arasıkəsilmədən yavaş-yavaş cərəyan edən dəyişmə.

◊ **Təkamül nəzəriyyəsi** – üzvi aləmin bir üzvi formadan başqa üzvi formaya keçmək yolu ilə inkişafı haqqında nəzəriyyə.

**TƏKAMÜLÇÜ** *is.* Təkamül nəzəriyyəsi tərəfdarı.

**TƏKAN** *is.* 1. Bir şeyi özündən uzaqlaşdırmaq məqsədilə bərk itələmə və ya zərbə. [Növrəstə] *tərəkəmələrdən qalmış köhnə keçəni üstünə çəkdiyi zaman qapıya bir təkan vuruldu.* Ə.Abasov. // Zərbə və ya silkələnmə nəticəsində sarsıntı. *Yeraltı təkanlar.* – [Şeyda:] *Əlikram əmi, zəlzələ, təkan, atom zəmanəsi deyilən çox mühüm amili hesaba almırsınız?* B.Bayramov.

2. *məc.* Hər hansı bir işin həyata keçməsi, sürətlənməsi və ya inkişafı üçün stimul ola biləcək daxili və ya xarici amil (bu mənada adətən "vermək", "vurmaq" feilləri ilə işlənir).

◊ **Təkan vermək** – itələmək. [Gəldiyev] *qapıya təkan verəndə bağlı olduğunu bildi*. Mir Cəlal.

**TƏKANLAMA** "Təkanlamaq"dan *f.is.*

**TƏKANLAMAQ** *f.* İtələmək. *..Aralığa basabas düşür. Bu onu, o bunu təkanlayır.* C.Məmmədquluzadə.

**TƏKATLI** b a x **biratlı**.

**TƏKAVARLI** *sif.* Bir avarla sürülən, hərəkətə gətirilən (qayıq haqqında). *Təkavarlı qayıq.*

**TƏKAYAQLI** b a x **birayaqlı**.

**TƏKBARMAQ** *sif.* Bir barmağı olan. ☐ **Təkbarmaq əlcək** – bir böyük barmağı olan əlcək.

**TƏKBARMAQLI** b a x **birbarmaqlı**.

**TƏKBAŞÇI** *is.* Təkbaşçılıq üsulu ilə rəhbərlik edən adam.

**TƏKBAŞÇILIQ** *is.* Rəhbərliyin bir adamın əlində olduğu iş üsulu.

**TƏKBAŞINA** *zərf* 1. Yalqız, yalnız, təkcə, tək özü. *Təkbaşına qalmaq. – Xan divan otağına gəlib, orada təkbaşına oturdu.* Çəmənzəminli. [Murad] *..nə vaxtadək bayquş kimi təkbaşına yaşayacaqdı?* S.Hüseyn.

2. Başqasının köməyi olmadan; tək, təkcə. *Təkbaşına məsələni həll etmək.* – [Südabə:] *Təkbaşına Zal oğlu; Üstün gələr onlara*. H.Cavid. // Özbaşına, nəzarətsiz, baxımsız.

[Səlim:] *..Hər kəs təkbaşına işləsə, arxın içinə uzadıb ölüncə döyəcəklər*. C.Cabbarlı.

3. Öz-özünə, müstəqil, rəhbərsiz, müəllimsiz.

**TƏKBƏTƏK** *zərf* 1. Birbəbir, bir-bir, hərəni ayrı-ayrılıqda. *Xalqın hünərindən danışar sənə; Dindirsən təkbətək hər kəsi burda.* S.Rüstəm. *Murad dayı bizim hamımızı təkbətək tanıyır*. İ.Əfəndiyev.

2. Mübarizədə, vuruşmada, yarışda iki nəfərin üz-üzə gəldiyi hal. *Təkbətək vuruşmaq.*

**TƏKBİR** *is.* [*ər.*] Namaz qılan zaman deyilən “Allahu əkbər” (Allah böyükdür).

**TƏKBUYNUZ(LU)** *sif.* Yalnız bir buynuzu olan; birbuynuzlu, taybuynuz. *Təkbuynuz öküz.*

**TƏKCƏ** *sif.* Ancaq tək, bircə. [Durna:] *Bu Aydəmir mənim təkcə qardaşımın yoldaşıdır*. C.Cabbarlı. // *zərf* Ancaq özü, tək. *Təkcə oturmaq. Təkcə qalmaq.*

**TƏKDƏNBİR** b a x **arabir**. *Gülpəri ocağın qırağında oturub, sinidə düyü arıtlayır, təkdənbir də əsnəyirdi.* M.Hüseyn. *Hərdən maşın səsi eşidilir, yaxın yollarda təkdənbir arabaya rast gəlmək olurdu*. Ə.Əbülhəsən.

**TƏKDIRNAQLILAR** *cəm zool.* Bir və ya üç dırnağı olan məməli heyvanlar. *Atların, eşşəklərin və kərgədanların barmaqlarının sayı tək* (*bir və ya üç*) *olur. Bu heyvanlar təkdırnaqlılar dəstəsinə aiddir.*

**TƏKDİR** *is.* [*ər.*] *kit*. Pisləmə, qəbahətləndirmə, danlama, bəyənməmə. *..Tiflisdə* “*Molla*”*nın intişarı şəriətmədarların əlinə təkdir çomağı verdi.* C.Məmmədquluzadə. ◻ **Təkdir etmək** – pisləmək, pis hesab etmək, qəbahətləndirmək, danlamaq.

**TƏKƏ** *is.* 1. Erkək keçi.

2. Vəhşi keçi, dağkeçisi. *On addım kənarda yatmayır təkə; Gəzinir oylağa baş çəkə-çəkə.* S.Vurğun. *Dağlarında sürü-sürü; Maral, təkə varmış*. R.Rza.

**TƏKƏBBÜR** [*ər.*] 1. *is.* İddia, təşəxxüs, lovğalıq, özünü çəkmə, fors. [Rüstəmovun] *..hər şeyə yuxarıdan baxan büzük gözlərinə hüdudsuz bir təkəbbür çöküb qalmışdı.* M.İbrahimov.

2. *sif.* Təkəbbürlü, iddialı, dikbaş, təşəxxüslü, lovğa, forslu. [Piri baba:] *Rəhmətlik qardaşımın cəmi xasiyyəti oğlu Əlimərdana keçmişdir. Atası kimi təkəbbür, kinli, höcət, qoçaq bir dəliqanlıdır*. S.S.Axundov. *Dünyada şöhrətpərəst və təkəbbür adamlar çox qorxaq olar*(*lar*). M.İbrahimov.

3. **Təkəbbürlə** şəklində zərf mənasında. *Cəmil də öz növbəsində təkəbbürlə döşünü qabardaraq Tahirə baxıb dedi.* M.Hüseyn. .. *Bir gəlin, öz gözəlliyini dərk edən qadınlara məxsus bir təkəbbürlə gəlib* [Sultan ilə Səmədin] *qarşısından keçdi*. İ.Hüseynov.

**TƏKƏBBÜRLÜ** *sif.* və *zərf* İddialı, təşəxxüslü, lovğa, mütəkəbbir, forslu. *Təkəbbürlü adam. – Xanpəri özündən bədgüman, keçmişinə arxayın, təkəbbürlü, heç kəsi bəyənməyən, bir sözlə, lovğa və forsludur*. Ə.Vəliyev.

**TƏKƏBBÜRLÜK** *is.* Lovğalıq, təşəxxüs, iddialılıq, mütəkəbbirlik, forsluluq. *Atasının əli aşağı düşməyindən* [Nurəddin] *bir o qədər qəm çəkmirdi, çünki təbiətində təkəbbürlük, təşəxxüslük əsla yox idi.* S.S.Axundov.

**TƏKƏLDUZ** *is.* [tək, əl və *fars.* ...duz – tək əllə tikilən] İranda, Orta Asiyada, Azərbaycanda ipək saplarla əyri xətlər və nəbati ornamentlər şəklində tirmə, mahud, şal və s. üzərində bədii tikmə növü və üsulu. *Məxmər, mahud və ipək parçalar təkəlduz üçün ən münasib parçalardır*. “Azərbaycan xalq sənəti”.

**TƏKƏLDUZÇU** *is.* Təkəlduz tikən usta (b a x **təkəlduz**).

**TƏKƏLDUZÇULUQ** *is.* Tətbiqi xalq sənətinin təkəlduz tikməklə məşğul olan sahəsi. *Xalq yaradıcılığının başqa sahələrinə nisbətən təkəlduzçuluq sahəsi ən az tədqiq olunan sahədir.* “Azərbaycan xalq sənəti”.

**TƏKƏLƏNMƏ** “Təkələnmək”dən *f.is.*

**TƏKƏLƏNMƏK** *f.* 1. Böyüyüb təkə olmaq (erkək keçi haqqında).

2. *məc. zar*. Həddi-büluğa çatmaq, böyük oğlan olmaq, yetkinləşmək.

**TƏKƏLLİ** b a x **birəlli**[1]. *Təkəlli işləmək.*

**TƏKƏLLÜF** *is.* [*ər.*] *köhn*. 1. Zəhmətə, əziyyətə qatlaşma.

2. Çapalama.

3. Saxta hərəkət, sünilik.

**TƏKƏMMÜL** *is.* [*ər.*] Kamala çatma, mükəmməlləşmə, təkmilləşmə, bitkinlik.

**TƏKƏMSEYRƏK** *sif.* və *zərf* Adda-budda, orada-burada, seyrək. *Bu söz iclasda təkəmseyrək gülüşməyə səbəb oldu.* Ə.Vəliyev. *Meşənin ətəyindən, təkəmseyrək kolların*

*arasından qarapaltarlı, irigövdəli bir arvad çıxdı.* İ.Hüseynov.

**TƏKƏR** *is.* [*ər.*] 1. Ox ətrafında fırlanıb təkərli nəqliyyat vasitələrini hərəkətə gətirən dəndəli və ya bütöv dairə; çarx. *Faytonçu muşqurdu. Təkərlərin yeknəsəq səsi at ayaqlarının tappıltısına qarışdı.* M.Hüseyn. *Göy otlar yatardı təkərlər altda; Beləcə düşərdi bağa ilk cığır.* N.Xəzri.

2. *məc.* Təkərə oxşayan hər cür şey; qövs, dairə. *Əjdər öz-özünə gümüldənirdi; Günəşin təkəri daha enirdi.* H.K.Sanılı.

3. *məc.* Obrazlı ifadələrdə: tale, qismət, bəxt. *Dünyanın təkəri gerimi döndü; Yoxsa üfüqlərdə günəşmi söndü?* S.Vurğun.

◊ **Tarixin təkərini döndərməyə çalışmaq** – tarixi inkişafın qanunauyğun gedişinin qabağını saxlamağa, geriyə qaytarmağa çalışmaq.

**TƏKƏRCİK** *is.* Kiçik təkər, balaca çarx; çarxcıq. *Dişli təkərcik. Oyuncağın təkərciyi.*

**TƏKƏRƏK** *is.* Təkərcik. *Şofer traktoru işə salıb təkərəyi yavaş-yavaş burmağa, kəndirin gərginliyini artırmağa başladı.* Mir Cəlal.

**TƏKƏRLİ** *sif.* Təkəri olan, təkərlə hərəkətə gətirilən; çarxlı. *Təkərli traktor.*

**TƏKƏRVARİ** *sif.* Təkər şəklində olan; girdə, dairəvi, çarx kimi.

**TƏKƏSAQQAL(LI)** *sif.* Çənəsində az uzun seyrək saqqalı olan. [Nəcəfalı:] *Arıq, gödək, təkəsaqqal bir kişi eyvana çıxdı.* B.Bayramov.

**TƏKƏŞ** *sif. məh.* Lovğa, özünü çəkən, özünü dartan, forslu.

**TƏKƏTƏK** b a x **təkbətək**. *Təkətək öhdəsindən gəlmək. – Bünyad Canı ilə belə təkətək görüşməmişdi.* Ə.Əbülhəsən.

**TƏKFİR** *is.* [*ər.*] *din. köhn.* Kafir elan etmə, mürtəd elan etmə, lənət oxuma; küfr, lənət. ☐ **Təkfir etmək** – lənətləmək, lənət oxumaq, kafir elan etmək, mürtəd elan etmək, dinsiz elan etmək. *Ziddimə söz deyən olsaydı edərdim təkfir; İşimi qurdalasın, kimdə nə cürət var idi?* M.Ə.Sabir. [Mirzə Turab:] *..Mollalar məni təkfir etdilər, mənə babi dedilər*. B.Talıblı.

**TƏKGÖZ(LÜ)** b a x **birgözlü**.

**TƏKHAKİMİYYƏTLİ** *sif.* Hakimiyyət bir adamın əlində olan, qeyri-məhdud hakimiyyəti olan. *Təkhakimiyyətli idarə üsulu.*

**TƏKHAKİMİYYƏTLİLİK** *is.* Hakimiyyətin bir adamın əlində toplanması; birisinin qeyri-məhdud hakimiyyəti.

**TƏKHECALI** b a x **birhecalı**.

**TƏKHƏDLİ** b a x **birhədli**.

**TƏKHÜCEYRƏLİ** *sif. biol.* Tək bir hüceyrəsi olan, bir hüceyrədən ibarət olan. *Təkhüceyrəli yosunlar. Təkhüceyrəli ibtidai canlılar.*

**TƏKİ** 1. Cümlədə arzu bildirən hissəcik. *Təki siz gələsiniz. Təki tez çıxıb gedəydik. Təki sən deyən kimi olaydı.* – [Gültəkin Aydına:] *Paltar da istəmirəm, təki sən fikir çəkməyəsən, nə eləyirəm paltarı?* C.Cabbarlı. *Mənsiz bu dünyanın olsan qonağı; Nə olar, sevgilim, sağ ol təki sən.* R.Rza. // *əd.* Kaş, kaş ki. *Təki* [Mədəd] *Gövhərdən, Hacıyevdən bir xəbər biləydi.* Ə.Əbülhəsən.

2. B a x **tək**[1] 6-cı mənada. [Hacı Fərəc:] *..Bədənim poladdan bərk, özüm saz, iyirmi yaşında cavan təki.* N.Vəzirov. *Əmək cəbhəsində də çalışdı əsgər təki; Al ipək pijamadır bu günsə əynindəki*. B.Vahabzadə.

**TƏKİD** [*ər.*] 1. *is.* Bir şeyin üstündə durma, israr etmə; israrla tələb etmə; israr. *Rəisin təkidinə baxmayaraq, Səlim sarı şineli götürmədi.* S.Rəhimov. ☐ **Təkid etmək (eləmək)** – bir şeyin üstündə durmaq, israrla tələb etmək, israr etmək. *Atası çox təkid edəndə Əmiraslan dedi: – Dədə, mən məktəbə getməyəcəyəm. Orada molla adamın ayağını falaqqaya salıb döyür*. S.S.Axundov. *Məşədibəy bir də təkid elədi, uşaq razı oldu.* M.Hüseyn.

2. **Təkidlə** şəklində – b a x **təkidən**.

**TƏKİDƏN** *zərf* [*ər.*] Təkid edərək, təkidlə, israrla. [Çopo:] *Təkidən söylədim ki, onun nicatı ordu toplayıb, xaqanın hücumundan özünü müdafiə etməsindədir*. Çəmənzəminli.

**TƏKİDLİ** *sif.* Təkid edərcəsinə, israrlı, inadlı. *Midhədin təkidli tələbləri komandirin ürəyinə təsir eləmişdi*. Ə.Vəliyev.

**TƏKİR** *sif.* Qırmızı lələkli (quşlar haqqında); qızıl pullu, qırmızı ağcalı (balıqlar haqqında).

**TƏKQAT(LI)** b a x **birqat(lı)**.

**TƏKQOL(LU)** b a x **tayqollu**. *Təkqollu kişi.*

**TƏKQULP(LU)** b a x **birqulplu**. *Bu çölü şumlarkən 75 santimetr dərinlikdən qırmızı gildən hazırlanmış qadın fiquruna oxşar bir təkqulp qab tapmışdılar.* (Qəzetlərdən).

**TƏKLƏMƏ** "Təkləmək"dən *f.is.*

**TƏKLƏMƏK** *f.* Ətrafındakılardan, yanındakılardan və ya yoldaşlarından ayırıb tək qoymaq, təcrid etmək. *Axırda* [dəliləri] *bir-birlərindən ayrı salıb təklədilər.* "Koroğlu". // Tək olmağından istifadə edərək üzərinə atılmaq və ya sıxışdırmaq. [Telli Şeydaya:] *Eşitdim, bala, eşitdim, orda, institutda səni necə təkləyiblər*. Ə.Məmmədxanlı. // Təklikdə görüşmək, danışmaq.

**TƏKLƏNMƏ** "Təklənmək"dən *f.is.*

**TƏKLƏNMƏK** *f.* Yoldaşlarından, yanındakılardan ayrılıb tək qalmaq, tək özü qalmaq. [Durna] *dolu torbanı çiyninə alıb, qızlardan aralandı, təklənib kəndə tərəf getdi.* Ə.Vəliyev. [Ədhəm] *bilirdi ki, Səlim təklənəndə öz təsir gücünü xeyli itirir, çaşır, təntiyir*. B.Bayramov.

**TƏKLİF** *is.* [*ər.*] 1. Qəbul edilmək üçün irəli sürülən fikir. [Cəmilə] *kimsənin təklifini yerə salmamış, bir neçə gənc oğlanla bərabər oynamışdı.* S.Hüseyn. *Adamların çoxu məmnuniyyətlə öz öhdəsinə yeni vəzifələr götürmüş və işin sürətlə getməsi üçün bir çox əməli təkliflər irəli sürmüşdü*. Ə.Sadıq.

2. Başqalarının müzakirəsinə verilən məsələ, onun haqqında irəli sürülən rəy. *Əjdər gurultunu kəsib, təklifi səsə qoydu..* S.Rəhimov. // Namizəd irəli sürmə. *Milli Məclisə deputatlığa namizəd haqqında təklif.*

3. Bir işi görməyə dəvət etmə; dəvət. *Saat iki tamamda otaq gənc qonaqlar ilə dolmuşdu. Bir azdan sonra Nurəddin qonaqlarını yemək otağına təklif etdi*. S.S.Axundov. *..Qulluqçu qız sol tərəfdəki qapını açıb,* [Rüstəm bəyə] *otağa baxmağı təklif elədi*. Çəmənzəminli.

4. Göstəriş, əmr. *Məşədi Həsənin təklifinə* "*baş üstə*"*dən özgə cavab tapmayıb durdum ayağa...* Ə.Haqverdiyev. *Milis nəfərləri maşından düşüb, şinellərini soyundular və təklif gözləmədən dəhnə, yaba götürüb, kol qırmağa başladılar*. Ə.Vəliyev.

5. Borc, vəzifə. *Üzərinə təklif düşmək.*

◊ **Təklifini bilmək (qanmaq)** – nə edəcəyini bilmək, öhdəsinə düşən vəzifəni dərk etmək. [Müsafir:] *Ey müsəlman qardaşlar!.. İki kəlmə sözümüz var, deyək, eşidin sonra siz də təklifinizi bilin, bizə də kömək eləyin.* C.Məmmədquluzadə. [Süleyman bəy:] *Mən uşaq deyiləm və öz təklifimi çox yaxşı qanıram*. Ə.Haqverdiyev.

**TƏKLİFSİZ** *sif.* və *zərf* Ədəb normalarını, nəzakət qaydalarını gözləməyən, hörmət gözləməyən; həyasız, ədəbsiz, sırtıq. *Təklifsiz adam. Təklifsiz içəri girmək.*

**TƏKLİFSİZCƏ(SİNƏ)** *zərf* Hörmətsizcəsinə, nəzakətsizliklə, həyasızcasına, sırtıqcasına, rəsmiyyət gözləmədən.

**TƏKLİFSİZLİK** *is.* Təklifsiz adamın hərəkət tərzi; hörmətsizlik, ədəbsizlik, nəzakətsizlik, sırtıqlıq; hörmət, rəsmiyyət gözləməmə.

**TƏKLİK** *is.* 1. Onluqda birinci, ən kiçik say; həmin sayı ifadə edən 1 (bir) rəqəmi. // Çoxrəqəmli ədədlərin axırıncı rəqəmi. *Yüzlük, onluq və təklik.*

2. Yalqızlıq, tək olma; tək qalmış adamın halı. *Bəli! İndi mən təkəm və bu təkliyimlə də fəxr edirəm*. Ə.Haqverdiyev. *Birdən Mayaya elə gəldi ki, qəriblik, təklik hiss etdiyi bu qəribə yerlərdə Qaraşdan başqa bir ümidi yoxdur.* M.İbrahimov. // Əri olmayan arvadın və ya arvadı olmayan kişinin halı; dulluq, ərsizlik və ya arvadsızlıq. [Sultan bəy:] *Olmur, təklik mənə əl vermir*. Ü.Hacıbəyov. [Gülsənəm] *əri öləndən bəri təkliyin ağrısını getdikcə daha çox duyurdu.* M.Hüseyn.

3. Bir manat dəyərində olan pul; birmanatlıq, manatlıq. *..Kərbəlayı Cəfər çıxdı eşiyə və bir qədər yubanıb gəldi, oturdu və cibindən bir beşlik və iki təklik çıxarıb qoydu Xudayar bəyin qabağına*. C.Məmmədquluzadə.

**TƏKLİKDƏ** *zərf* 1. Təkcə, ayrıca, yalqız. *Şair təklikdə oturub, saatlarla xəyala dalmağı da çox sevirdi.* S.Rəhimov.

2. Başqasının və ya başqalarının köməyi olmadan; təkbətək, tək özü, təkbaşına. *Sülü təklikdə Əliqulu ilə bacarmadı, Əliqulu yerdən qalxıb Sülüyə bir ağac vurdu.* Çəmənzəminli.

**TƏKLÜLƏ** *is.* Bir lüləsi olan tüfəng, ya tapança. *Qarakişi .. gah Şahmara, gah Yusifə, gah da təklüləsinə baxıb qapıdan çıxdı.* B.Bayramov. // *sif.* Bir lüləsi olan. [Səlim] *özünə bir dəst yaxşı ov paltarı, rezin çəkmə və bir təklülə qatlama tüfəng almışdı*. M.Rzaquluzadə.

**TƏKMƏNALI** *sif. dilç.* Ancaq bir mənası olan (*çoxmənalı* əksi). *Təkmənalı söz.*

**TƏKMƏNALILIQ** *is. dilç.* Bir mənası olma (*çoxmənalılıq* əksi). *Sözün təkmənalılığı.*

**TƏKMİL** *is.* [*ər.*] *klas.* Bir işin qurtarması, sona çatması, bitməsi. ☐ **Təkmil etmək** *klas.* – qurtarmaq, sona yetirmək, bitirmək, başa çatdırmaq, tamamlamaq. *Söylə mənə: – Gər eyləməsəm dərsimi təkmil; Girməz başıma ər sözü, gər bitməsə təhsil.* M.S.Ordubadi. // Bütün, tam, əskiksiz, nöqsansız, kəsirsiz. ☐ **Təkmil olmaq** – qurtarmaq, tamamlanmaq. [Molla İbrahimxəlil:] *..İkinci kürənin iksirinin təkmil və tamam olmağına bir ay qalıbdır.* M.F.Axundzadə.

**TƏKMİLLƏŞDİRİLMƏ** "Təkmilləşdirilmək"dən *f.is.*

**TƏKMİLLƏŞDİRİLMƏK** *məch.* Daha yaxşı, daha mükəmməl hala gətirilmək; mükəmmələşdirilmək. *Neftçıxarma üsulları getdikcə təkmilləşdirilir.*

**TƏKMİLLƏŞDİRMƏ** "Təkmilləşdirmək"-dən *f.is. Ustalığı təkmilləşdirmə. Texnikanı təkmilləşdirmə.*

**TƏKMİLLƏŞDİRMƏK** *f.* Daha yaxşı, daha mükəmməl hala gətirmək, mükəmməlləşdirmək. *Neftayırma üsullarını təkmilləşdirmək.*

**TƏKMİLLƏŞMƏ** "Təkmilləşmək"dən *f.is.*

**TƏKMİLLƏŞMƏK** *f.* Daha yaxşı, daha mükəmməl hala gəlmək; mükəmməlləşmək. *MTS-lər birləşib təkmilləşəndə Hatəmov da .. işə çox ciddi girişmişdi.* B.Bayramov.

**TƏKMİLLİLİK** *is.* Təkmil olma, mükəmməllilik, nöqsansızlıq, kəsirsizlik. *Yağlama sisteminin təkmilliliyi.*

**TƏKNƏ** *is.* 1. Əsasən xəmir yoğurmaq üçün işlədilən dərin, iri, taxta mətbəx aləti; dərin tabaq. *Mələk bacı dizləri üstə oturub, kəndli qadınlara məxsus təmkin və səliqə ilə təknədə xəmir yoğururdu.* Ə.Sadıq. *Burada təknə, tabaq, oxlov, qazan, sacayaq və yemək-içməyə gərək olan sair qab-qacaq az deyildi.* Ə.Əbülhəsən.

2. Ekskavatorun çalovu. *Yarım ton ağırlığında olan təknə yüngül bir top kimi bir tərəfdən o biri tərəfə tullanırdı.* Ə.Sadıq. *Mazuta bulaşmış torpaq sahəsinin kiçik parçasını nəhəng bir ekskavatorun təknəsi ilə çevirmişdilər.* Y.Əzimzadə.

3. Bir təknə tutan miqdar. *İki təknə buğda. Üç təknə un. – Tamam boşaldı anbar; Bircə təknə unum var.* S.Vurğun.

**TƏKRAR** *is.* [*ər.*] Bir işi bir daha, yenidən görmə, bir neçə dəfə etmə; bir sözü bir daha, yenidən söyləmə. *Məqalədə təkrar çoxdur.* – [Şeyx Sənan:] *İbn Məryəm asıldı darə, fəqət; Onu təkrarə varmıdır hacət?* H.Cavid. *Yəqin ki, təbiət də sənət kimi təkrarı sevmir.* M.Rzaquluzadə. // Zərf mənasında. *Kazım əllərini təkrar döşünə qoyub baş əydi, sonra dizi üstə döşəkçəsinin üstündə oturdu.* Çəmənzəminli. *Mehriban təkrar hirsləndi.* S.Hüseyn. ☐ **Təkrar etmək** – b a x **təkrarlamaq**. *Eldar qayıdıb gəldikdə Daşdəmir əminin sözlərini təkrar etdi.* M.Rzaquluzadə. *Ləmanın Seymur haqqında dediklərini o da eynilə anası üçün təkrar edirdi.* H.Seyidbəyli; // dərsi və ya başqa bir şeyi daha dərindən mənimsəmək üçün təkrarən oxumaq. *Məsələni təkrar həll etmək.* – [Nuriyyə:] *Keçdiyimiz bütün riyaziyyat düsturlarını, qaydalarını bir də təkrar etdim.* İ.Əfəndiyev.

**TƏKRAREDİLMƏZ** *sif.* Tayı-bərabəri olmayan, təkrar edilə bilməyən. *Təkraredilməz sənət əsəri.*

**TƏKRARƏN** *zərf* [*ər.*] Təkrar olaraq, təkrar-təkrar. *Kərimzadə, Sənubərin gözünün içinə baxıb, Həmişəyevin fikrini təkrarən təsdiq elədi.* B.Bayramov.

**TƏKRARLAMA** "Təkrarlamaq"dan *f.is.*

**TƏKRARLAMAQ** *f.* Təkrarən etmək, bir şeyi neçə dəfə etmək; bir sözü yenə də, bir daha, yenidən söyləmək. *Elə bil təbiət bir şair kimi; Sevdiyi misranı təkrarlamışdır.* N.Xəzri. [Səməndər:] *İki-üç anlamazın dediklərini niyə təkrarlayırsan, ay ana?* B.Bayramov.

**TƏKRARLANMA** "Təkrarlanmaq"dan *f.is.*

**TƏKRARLANMAQ** *məch.* Təkrarən edilmək, bir neçə dəfə edilmək, təkrar olunmaq; təkrarən, yenidən, bir daha söylənmək. *Söhbət təkrarlandı. Səhvlər təkrarlandı. Qapının zəngi təkrarlandı.*

**TƏKRARLATMA** "Təkrarlatmaq"dan *f.is.*

**TƏKRARLATMAQ** *icb.* Təkrarən etdirmək, bir işi bir neçə dəfə gördürmək, təkrar etdirmək.

**TƏKRAROLUNMAZ** b a x **təkraredilməz**.

**TƏKRAR-TƏKRAR** *zərf* Təkrarən, bir neçə dəfə, dəfələrlə. *Dinləmişəm gənc ikən Bakıda təkrar-təkrar; Sizin Şirvanzadəni, bizim Şirvanzadəni.* S.Rüstəm.

**TƏKRİR** *is.* [*ər.*] Təkrarlama, təkrar.

**TƏKSƏSLİ** *sif. mus.* Yalnız bir səslə ifa edilən, bir səsdən ibarət olan. *Beləliklə, əvvəllər yalnız təksəsli olan musiqi getdikcə çoxsəsli musiqi ilə əvəz edilmişdir.* Ə.Bədəlbəyli.

**TƏK-TƏK** *sif.* və *zərf* 1. Birbəbir, bir-bir, ayrı-ayrılıqda. *Mirqasım mollaların bəzilərinə tək-tək salam verməyə başladı.* S.Rəhman.

2. Hərdənbir, arabir, bəzən, nadir. *Məni də yorduqca arabir şəhər; Muğanın seyrinə çıxıram tək-tək.* S.Vurğun. [Coğrafiya müəllimi] *ancaq tək-tək hallarda gimnazistlərə yüksək qiymət verərdi.* Q.İlkin.

3. Birgə deyil, ayrı-ayrılıqda bir-bir, ayrı-ayrı. *Hamı tək-tək gəlib Cəfərqulu ilə əl-ələ görüşdü.* Qantəmir. *Bu quşlar çox vaxt tək-tək, bəzən də cüt-cüt gəzər, ..yalnız düz üstlərinə çıxdıqda havaya qalxarlar.* M.Rzaquluzadə.

4. Adda-budda, bir-birindən aralı. *Ötədəbəridə tək-tək ulduzlar fərq edilirdi.* S.Hüseyn. *Külək ağacları gətirir dilə; Fənərlər alışır yollarda tək-tək.* H.Hüseynzadə.

**TƏK-TƏNHA** *sif.* və *zərf* Yalqız, tək, təkcə. *Cəlal indi tək-tənha idi.* S.Vəliyev. *Ağappaq xalat geyinmiş Aydın tək-tənha öz otağında oturub gözləyirdi.* H.Seyidbəyli.

**TƏKTƏSƏRRÜFATÇI** *is.* Ayrıca müstəqil təsərrüfatı olan və kənd təsərrüfatı artelinin üzvü olmayan kəndli. *Təktəsərrüfatçı əmlakı.*

**TƏK-TÜK** *sif.* Tək-tək, arabir. *Ancaq tək-tük üstüörtülü faytonlar içində miniklər görünürdü.* S.M.Qənizadə. [Koroğlu:] *Doğrudur, indi də aramızda tək-tük ziyalılar tapılır.* Ə.Haqverdiyev.

**TƏKYƏ[1]** *is.* [*ər.*] 1. *köhn.* Söykənəcək, dayanacaq. ☐ **Təkyə eləmək (etmək)** – 1) söykənmək, dayanmaq. *Rzaquluxan suyu içdikdən sonra balışa təkyə edib, yavaş-yavaş göz yaşı tökməyə başladı.* M.S.Ordubadi; // söykəmək, dayamaq, dəstəkləmək. [Molla Həmid:] *Başını yuxarı qovzuyub, gözünü çadırın səqfinə dikib, sağ əlinin baş barmağı ilə çənəsinə təkyə edib, .. cavab verir.* M.F.Axundzadə; 2) əsaslanmaq, istinad etmək. *Rəsmi mənbədən bizə çatan bəzi məlumata təkyə etsək, görərik ki, keçən il təhsili qurtaran on səkkiz nəfər* [azərbaycanlı] *mamaların bir çoxu kəndlərə dağılıbdır.* C.Məmmədquluzadə.

2. Məhəccər, söykənəcək, sürahi. *Qərənfil bacı eyvanın təkyəsinə yaxınlaşaraq .. səslədi.* İ.Əfəndiyev.

**TƏKYƏ[2]** *is.* [*ər.*] Təriqətçilərin, dərvişlərin ayin icra etdikləri yer. *Dərvişlikdən xəbəri yox, gecə-gündüz təkyə axtarır.* (Ata. sözü). *Odur ki, hər bir toya, təziyəyə, təkyəyə adam çağırmaq lazım olsa, bunu da Hacı Tağıya tapşırırlar.* Ə.Haqverdiyev. // Təziyə, yas, hüzr yeri. *Bir gün, baharın son ayında Şərəbanı xanım qonşuya təkyə yerinə getmişdi.* E.Sultanov. ☐ **Təkyə saxlamaq** – hüzr məclisi qurmaq, təziyədarlıq etmək. *Məhərrəmlik münasibətilə bu karvansaranın həyətində təkyə saxlayıb təziyədarlıq edilərdi.* S.Hüseyn.

**TƏKYƏLƏNMƏ** "Təkyələnmək"dən *f.is.*

**TƏKYƏLƏNMƏK** *f.* Söykənmək, dayaq vermək, dayanmaq. *Çomağa təkyələnmək.* – [Əsgər] *təkyələndiyi çantadan başını qaldırdı.* H.Nəzərli.

**TƏKZİB** *is.* [*ər.*] Bir məlumatın, xəbərin, şayiənin və s.-nin yalan olduğunu məlumat, çıxış, məqalə və s. ilə sübut etmə; yalanlama. ☐ **Təkzib etmək** – yalan olduğunu, doğru olmadığını sübut etmək, elan etmək, bildirmək. *Mərdan bir söz deməyə cəsarət etmədi, gəlinin halət və hərəkəti qayınananın iftirasını təkzib edirdi.* Çəmənzəminli.

**TƏKZİBEDİLMƏZ, TƏKZİBOLUNMAZ** *sif.* Təkzib oluna bilməyən; mübahisəsiz, şübhəsiz. *Təkzibedilməz* (təkzibolunmaz) *fakt.* – *Azərbaycanın əfsanə və nağılları* [Nazlı üçün] *təkzibolunmaz bir həqiqət kimi yığılıb, sinədəftərində səbt olunmuşdu.* Çəmənzəminli.

**TƏQAÜD** *is.* [*ər.*] 1. Tələbələrə, aspirantlara müntəzəm surətdə verilən pul müavinəti, yardımı; stipendiya.

2. B a x **pensiya**. *Fərdi təqaüd. Təqaüd almağa bir ili qalıb. Təqaüdə çıxmaq.* – *Təqaüdlə saxlayırdı; İndi ana körpələri.* M.Dilbazi.

**TƏQAÜDÇÜ** *is.* və *sif.* 1. Təqaüd alan tələbə; stipendiyaçı. *Təqaüdçü tələbə.*

2. B a x **pensiyaçı**.

**TƏQAZA** *is.* [*ər.*] *klas.* Tələb. *Neçin dəyişməsin fikri insanın; Təqazası deyilmi bu,*

*dünyanın.* A.Səhhət. *Ərbabi-qələmimizə borcdur* [qəzetin] *mündəricatını xeyirli və zəmanənin təqazasına müvafiq məlumat ilə doldursun.* F.Köçərli.

**TƏQDİM** *is.* [*ər.*] Bir şeyi vermək üçün əlində tutaraq birinin (adətən böyük və ya hörmətli bir şəxsin) hüzuruna gətirmə, ona vermə. ◻ **Təqdim etmək** – 1) vermək üçün əlində tutaraq birinin (adətən böyük və ya hörmətli bir şəxsin) qabağına gətirmək, vermək. *Dörd nəfər gözəl kəniz əlvan yeməklər gətirib, qadına və Fəxrəddinə təqdim etdilər.* M.S.Ordubadi; 2) tanış etmək. *İşə yeni qəbul olunanları bir-bir sex müdirinə təqdim etdilər. – Teymur bəy ev sahibəsini və qızını müsafirlərə təqdim etdi.* Çəmənzəminli; 3) elmi şura, iclas və s.-nin müzakirəsinə, təsdiqinə vermək. *Dissertasiya işini müdafiəyə təqdim etmək. – Memar Sadıqzadənin təqdim etdiyi layihələr salondakılar tərəfindən təqdir edildi.* S.Rəhimov.

**TƏQDİMAT** *is.* [*ər.* "təqdim" söz. cəmi] *rəs.* Yuxarı təşkilatlara yazılı məlumat, müraciət, yazılı bəyanat. *Mükafat haqqında təqdimat yazmaq.*

**TƏQDİR** *is.* [*ər.*] 1. Qəbul (etmə), bəyənmə, qiymətləndirmə, alqışlama; dəyərini, əhəmiyyətini anlama. [Buğac] .. *atasının təhsin və təqdirini qazanacaqdı.* M.Rzaquluzadə. ◻ **Təqdir etmək** – qəbul etmək, bəyənmək, qiymətləndirmək, alqışlamaq. *Nə qədər ki Cavahir atasının evində idi, heç kəs bunun işini təqdir etməyirdi.* T.Ş.Simurq. *Zalda müxtəlif səslər eşidildi. Kimi Zeynəbin təklifini təqdir edir, kimi şübhə altına alırdı.* M.İbrahimov.

2. *klas.* Qismət, nəsib, tale (bəzən "təqdiriqəza" şəklində). [Kərəm:] *Bizə belə imiş təqdirin işi; Axıtdı gözümdən qan ilə yaşı.* "Əsli və Kərəm".

3. ...**təqdirdə** – şərt bildirir; ...halda, əgər... *Gəldiyi təqdirdə* (əgər gəlsə, gələrsə). ◻ **Əks təqdirdə** – əks halda, belə olmadıqda. [Partizanlar] *əks təqdirdə* [Silanı] *bu döyüşə göndərməzdilər.* S.Vəliyev. **O təqdirdə** – elə olduqda (olsa), o halda.

**TƏQDİRƏLAYİQ** *sif.* Təqdir edilə bilən; bəyənilməli, yaxşı. *Təqdirəlayiq təşəbbüs. Təqdirəlayiq hərəkət.*

**TƏQDİS** *is.* [*ər.*] *klas.* Müqəddəs bilmə, müqəddəsləşdirmə, sitayiş etmə, tapınma. ◻ **Təqdis etmək** – müqəddəsləşdirmək, sitayiş etmək, tapınmaq. [Bir mələk Şeyx Sənana:] *Səni təqdis edər mələklər, inan; Heç təlaş etmə gəl, böyük Sənan!* H.Cavid. [Ruhnəvaz:] *Tolstoyla Turgenevi çox oxuyuram, Mopassanı təqdis edirəm.* Çəmənzəminli.

**TƏQƏLLÜB** *is.* [*ər.*] 1. Dönmə, başqa tərəfə çevrilmə.

2. Fırıldaq, kələk.

**TƏQİB** *is.* [*ər.*] 1. İzinə düşmə, ardınca getmə, addımbaaddım dalına düşmə, izləmə. *Maral başını aşağı salıb ağac gövdəsinə söykənmiş, elə bil məruz qaldığı təqiblərdən yorulub indi dərin fikrə getmişdi.* Ə.Məmmədxanlı.

2. *məc.* Narahat etmə, əziyyət vermə, təngə gətirmə. *İki ay əvvəl* [Surxay] *təqibdən qaçıb kəndə gəlmişdi.* Ə.Vəliyev. // Sıxışdırma, zülm etmə. *Təzyiq və təqiblərə baxmayaraq, Bakı fəhlələri gizlində üsyana hazırlaşırdılar.* Q.İlkin.

◊ **Təqib etmək** – 1) tutmaq, ələ keçirmək, göz qoymaq və s. məqsədlə birinin izini tutub dalınca getmək; izləmək. *Ovu təqib etmək. – Bölük, qaçan düşməni təqib etməkdə idi.* H.Nəzərli; 2) ardınca getmək, dalınca getmək, müşayiət etmək. *Zeynal matəm alayını təqib edənlərə məxsus məyus addımlar ilə sahil boyu ilə evə qayıdırdı.* S.Hüseyn; 3) *məc.* bir-birinin ardınca gəlmək, bir-birini izləmək. *Hadisələr bir-birini təqib edirdi.* S.Hüseyn. *..Bir-birini təqib edən dəhşətli gurultular dağlarda əks-səda verə-verə uzaqlara yayıldı.* B.Bayramov; // ardınca gəlmək, dalınca gəlmək. *Qışı bahar təqib edər. – Hər vüsalı daima təqib edər bir ayrılıq.* H.Cavid; 4) *məc.* sakitlik verməmək, narahat etmək, əziyyət vermək. *Fikir onu daim təqib edirdi. – ..*"*Əkinçi*" *qəzeti üçün Zərdabini hər yerdə, hətta öz evində belə təqib edirdilər.* C.Cəfərov.

**TƏQLİD** *is.* [*ər.*] 1. Başqasının hərəkətini, danışıq tərzini və s.-ni eynilə təkrar etmə, özünü ona oxşatmağa çalışma; yamsılama. ◻ **Təqlid etmək** – başqasının hərəkətlərini, danışıq tərzini və s. xüsusiyyətlərini təkrar etmək, özünü ona oxşatmağa çalışmaq, yamsılamaq. *Marat danışanda açıqdan-açığa Tər-*

*lanı təqlid edirdi, bəzi sözləri onun kimi cəld və kəskin deməyə xüsusi fikir verirdi*. M.Hüseyn. *3-4-cü sinfin uşaqları İlyas müəllimin dərsini vaxtında öyrənir, sözünə qulaq asır, hərəkətini təqlid edirdilər*. Mir Cəlal. **Təqlidini çıxarmaq** – gülmək üçün başqasını yamsılamaq. *Əyyar Bəhramın iki şir arasından tacı götürüb başına qoyduğunun təqlidini çıxarır.* A.Şaiq. [Nəbi:] *Biz, ağaların qumar oynamalarının təqlidini çıxardırıq.* S.S.Axundov.

2. Başqa əsərə bənzədilərək yaradılan əsər; oxşatma, bənzətmə. *Əsər orijinal əsər deyil, təqliddir*.

**TƏQLİDÇİ** *is.* Başqasını təqlid edən adam, təqlid çıxaran.

**TƏQLİDÇİLİK** *is.* Təqlid etmə, təqlid çıxarma xasiyyəti. *Təbriz xalqında təqlidçilik Şərqin başqa xalqlarına nisbətən bir neçə qat artıqdır.* M.S.Ordubadi.

**TƏQLİDƏN** *zərf* [*ər.*] Təqlid edərək, oxşadaraq, bənzədərək, yamsılayaraq. *Tibb bacısı yenə həkimə təqlidən rəsmi bir əda ilə dedi.* M.Hüseyn.

**TƏQRİBƏN** *zərf* [*ər.*] Dəqiq deyil, təxmini, təqribi; təxminən. [Çopo:] *Təqribən on səkkiz-on doqquz yaşlarında olan bu qız son dərəcə ciddi və bəlkə bir az da sərt-təbiətli idi.* Çəmənzəminli. *Təqribən bir-iki saat keçmiş qəfildən ayıldım.* Ə.Məmmədxanlı.

**TƏQRİBİ** *sif.* [*ər.*] Təqribən, təxminən, təxmini. *Təqribi hesablama*.

**TƏQRİR** *is.* [*ər.*] 1. Yerini təyin etmə.

2. Möhkəmləndirmə.

3. Bəyan etmə.

**TƏQSİM** *is.* [*ər.*] Hissələrə bölmə, bölüşdürmə; bölgü. *..Vərəsələr bu təqsimə razı idilər.* S.Hüseyn. ☐ **Təqsim etmək** – bölmək, bölüşdürmək. *Çünki Sərdar Rəşidin vərəsələri Təbrizə gəldikdən və ev şeylərini öz aralarında təqsim etdikdən sonra, orada Mahru üçün heç bir şey qalmırdı.* M.S.Ordubadi. **Təqsim olunmaq** – bölünmək, bölüşdürülmək. [Molla Xəlil] *kəndlilərin boynuna böyük bir minnət qoyardı, çünki kəndin ölüləri onun namazı və quranı ilə dəfn edildiyi kimi, malları da onun əli ilə vərəsələr arasında təqsim olunar*(*dı*). S.Hüseyn.

**TƏQSİR** *is.* [*ər.*] Adi, hamı tərəfindən qəbul olunmuş, hamı üçün məcburi qaydalara, əxlaq norma və qaydalarına zidd hərəkət; günah, suç. *Əmiraslan təqsiri boynuna alıb əmisindən üzr istədi*. S.S.Axundov. *Peşimanam, bağışla, sorma təqsir kimdədir*. S.Rüstəm.

**TƏQSİRKAR** *is.* [*ər.* təqsir və *fars.* ...kar] b a x **təqsirli**. // Səbəbkar.

**TƏQSİRKARLIQ** *is.* Təqsirlilik, günahkarlıq, müqəssirlik, suçluluq.

**TƏQSİRLİ** *sif.* Təqsiri, günahı olan, bir şeydə təqsirləndirilən; suçlu, təqsirkar. [Heydər bəy:] *Murov, naçalnikin qərəzi nədir, buyursun görüm, burada təqsirli yoxdur ki, ondan qaça!* M.F.Axundzadə.

**TƏQSİRNAMƏ** *is.* [*ər.* təqsir və *fars.* ...namə] İttihamnamə, ittiham vərəqəsi. [Muxtar Firəngizə:] *Bağışlanmaz bir canini mühakimə edərkən belə, təqsirnaməsini ondan gizlətmirlər*. B.Bayramov.

**TƏQSİRSİZ** *sif.* Təqsiri, günahı olmayan: günahsız, gücsüz.

**TƏQSİRSİZLİK** *is.* Təqsiri, günahı olmama: günahsızlıq, suçsuzluq.

**TƏQTİ** *is.* [*ər.*] *ədəb.* Şerin hər misrasında durğuya, fasiləyə əsaslanan bölgü (həm heca və əruz vəznlərində, həm də sərbəst nəzmdə olur).

**TƏQVİM** *is.* [*ər.*] 1. Vaxtın, təbiətin dövraşırı hadisələrinə əsasən hesablanma sistemi; kalendar. ☐ **Hicri təqvim** – b a x **tarixi-hicri**. **Miladi təqvim** – xristian dininə görə İsanın anadan olduğu gündən hesablanan və hazırda işlənən təqvim.

2. İlin bütün günlərini (habelə istirahət, bayram, yaxud əlamətdar hadisə günlərini) göstərən, bəzən cürbəcür məlumat yazıları olan dəftərçə və ya vərəqə. *Divar təqvimi. – Divarlarda təqvimlər, xəritələr, teleqraf kağızları və məktublar asılmış*(*dır*). H.Cavid. *Gülpərinin gözü stolun üstündəki təqvimə sataşdı*. Ə.Vəliyev.

**TƏLAŞ** [*ər.*] *is.* 1. Həyəcan, iztirab, təşviş, həyəcan və iztirab içində tələsmə, əl-ayağa düşmə, təşvişə düşmə. *Tellinin təlaşı* [Səfəri] *heyrətə gətirdi..* Çəmənzəminli. ☐ **Təlaş etmək** – b a x **təlaşa düşmək**. [Cəmil bəy Humaya:] *Heç quru bir heykəl edam ediləcəyi üçün təlaş edərmi?* H.Cavid. *Fələkət başımızın üzərində idi. Təlaş edirdik*. S.Hüseyn.

**Təlaşa düşmək** – həyəcana düşmək, təşvişə düşmək, əl-ayağa düşmək, vahiməyə düşmək. [Vaqif:] *Belə mülahizə edirəm ki, hələ təlaşa düşmək lazım deyildir*. Çəmənzəminli. *Qaranlıqda qalan ana sevinməyə macal tapmamış təlaşa düşdü*. Ə.Məmmədxanlı.

2. Həyəcan, gurultu-patıltı. *Meydanda bir təlaş var*.

**TƏLAŞLI** *sif.* və *zərf* İztirablı, təşvişli, həyəcanlı, təlaş içərisində. *Ulduz təlaşlı fikirləri başından qovmaq üçün daha artıq səylə işləyir, özünü yorurdu*. Ə.Məmmədxanlı.

**TƏLATÜM** *is.* [*ər.*] 1. Tufan, bərk ləpələnmə, dalğalanma, coşma. *Dənizdə .. elə bir təlatüm var idi ki, heç deməyə gəlməz.* Ə.Sadıq. ☐ **Təlatümə gəlmək** – bərk dalğalanmaq, ləpələnmək, coşmaq. *Bir azdan sonra, bərk yel əsib tufan qopdu, dərya təlatümə gəldi.* (Nağıl). **Təlatümə gətirmək** – bərk dalğalatmaq, ləpələndirmək, coşdurmaq. *Gilavar dənizi təlatümə gətirdi*. M.Hüseyn. // Obrazlı təşbehlərdə. *Sənin varlığından bir an içində; Milyon təlatümlər, tufanlar keçir*. N.Xəzri. *Hisslər, döyüntülər təlatümündə; Üzür Cəmilənin fikri, xəyalı*. B.Vahabzadə.

2. *məc.* Çaxnaşma, vəlvələ, həyəcan, keşməkeş. ☐ **Təlatümə gəlmək** – həyəcanlanmaq, coşmaq. **Təlatümə gətirmək** – həyəcana gətirmək, hərəkətə gətirmək, çaxnaşdırmaq, təlaşa salma. *Bu dastan.. Yavərin sinəsində arxayın yatan duyğuları təlatümə gətirdi.* M.İbrahimov.

**TƏLATÜMLÜ** *sif.* və *zərf* 1. Coşqun, dalğalı, tufanlı. *Bu gün Adriatik dənizi son dərəcə təlatümlü idi.* S.Vəliyev.

2. *məc.* Həyəcanlı, təlaşlı, iztirablı; kəşməkeşli. *Məsumə daxilən nə qədər təlatümlü idisə, zahirən o qədər sakit və təmkinli görünürdü.* B.Bayramov.

**TƏLƏ** *is.* Vəhşi və ov heyvanlarını və ya quşları, eləcə də siçan və s. tutmaq üçün cürbəcür qurğu. *Sərçəni bir qırğı edərkən şikar; Bir tələyə oldu qəzadan düçar*. A.Səhhət. *Tələyə də bir zorba siçovul çoxdan düşüb gəbərmişdir.* H.Sarabski. // *məc.* Hiylə, qurğu. [Mahmud bəy:] *Çoxdandır gözləyir yolunu tələ; Nəbi bu gün-sabah keçəcək ələ.* S.Rüstəm.

◊ **Tələ qurmaq** *məc.* – birini aldatmaq üçün qurğu qurmaq, tədbir görmək, hiylə işlətmək. [Səfi bəy:] *Çingizə bir elə tələ qurmuşam ki, əlimdən qurtarası deyil*. S.S.Axundov. **Tələyə düşmək** *məc.* – hiyləyə uymaq, hiyləyə aldanmaq, tora düşmək. *Dəmirov tələyə düşdüyünü anlayırdı*. S.Rəhimov. **Tələyə salmaq** *məc.* – hiylə ilə birini çıxılmaz vəziyyətə salmaq, tora salmaq. [İbrahim bəy:] *..Mən onu elə bir tələyə salım ki, ölənə qədər çıxa bilməsin*. N.Vəzirov. [Veysəl:] *İki yüzdən artıq fəhlə səni göröndə zağ-zağ əssin, iki gədə səni tələyə salsın?!* Ə.Vəliyev.

**TƏLƏB** *is.* [*ər.*] 1. Bir şeyi israrla, qəti şəkildə xahiş və ya təklif etmə, istəmə. *Onun tələbini nəzərə aldılar. Sənin tələbin nədir? – Teymurun yalvarışları da, tələbi də, təhdidi də nəticəsiz qaldı.* M.Hüseyn. ☐ **Tələb etmək** – 1) bir şeyi israrla, qəti şəkildə istəmək, xahiş və ya təklif etmək. *Vəsiqəsini tələb etmək. Haqqını tələb etmək. İşsizliyin ləğv edilməsini tələb etmək. – ..Hökumət və partiya hər kəsdən öz vəzifəsini düzgün yerinə yetirməyi tələb edir.* Ə.Sadıq; // gözləmək, ummaq. *Ondan nə tələb etmək olar?* 2) bir şeyə ehtiyacı olmaq; istəmək. *Köhnəlmiş bina əsaslı təmir tələb edir. Bu iş çoxlu vəsait tələb edir. Quru torpaq bollu su tələb edir;* 3) bir yerə gəlməyi təklif və ya məcbur etmək; çağırmaq. *Onu polis idarəsi tələb edir.*

2. Qəti şəkildə ifadə olunan inadlı, təkidli xahiş, arzu, istək, təklif. *Tətilçilərin tələbi*. – [Xanlar:] *İndi pul davası aparmırıq biz; İndi çox böyükdür tələblərimiz*. S.Vurğun. [Ataş:] *Tələblərimizə əməl olunmayınca sözümüzdən dönməyəcəyik!* Ə.Vəliyev.

3. Bir şəxsin və ya şeyin uyğun gəlməli olduğu şərtlərin və xüsusiyyətlərin məcmusu; norma (adətən cəm şəklində). *Doktorluq dissertasiyasının qarşısında qoyulan tələblər. Ali məktəbə girmək üçün tələblər. Müasir tələblərə cavab vermək.*

4. Ancaq cəm şəklində: **tələblər** – tələbat, ehtiyac. *Cəmiyyətin mədəni tələbləri. Oxucuların tələbləri. – Vəkil də bütün tələbləri ödəyir, kisə-kisə əşrəfi xərcləyirdi*. Çəmən-

zəminli. *Kolxozlarımız varlandıqca kəndlinin mədəni tələbləri də çoxalır.* İ.Əfəndiyev.

**TƏLƏBAT** *is.* [*ər.* "tələb" söz. cəmi] 1. Tələb, tələb etmə, tələb olunan şeylər. *Xalqın tələbatı. – Günlərin birində Qətibə bu tələbatı bir daha aralığa atdığı zaman Qızıl Arslan qəti surətdə rədd cavabı verib dedi.* M.S.Ordubadi.

2. *iqt.* Bir mala, işçi qüvvəsinə olan tələb. *Təklif və tələbat. Xalqın artan tələbatı.*

**TƏLƏBDAR** [*ər.* tələb və *fars.* ...dar] *köhn.* bax **müddəi** 1-ci mənada. [Məmmədəli:] *Məcid və Qurbanəli, duruz qabağa; Məcid tələbdar, Qurbanəli cavabdeh.* N.Vəzirov.

**TƏLƏBƏ** *is.* [*ər.*] Ali məktəb və ya texnikumda oxuyan adam. *Mən təklif edirəm, birinci sözü aramızdakı yaşlı yoldaşlara verək, – deyə, bir tələbə yerindən dilləndi.* S.Hüseyn. *Bilikli müəllimin tələbəsi olmaq böyük şərəfdir.* Ə.Vəliyev.

**TƏLƏBƏLİK** *is.* Ali məktəbdə və ya texnikumda tələbə olma, oxuma, təhsil alma. *Sonradan polis məmurları darülfünun binasında durub, gələn tələbələrin tələbəlik biletlərini yoxlamağa başladılar.* T.Ş.Simurq. [Cəmilə] *Əhmədin tələbəlik həyatını gözü qabağına gətirir.* S.Rəhimov.

**TƏLƏBKAR** *sif.* və *is.* [*ər.* tələb və *fars.* ...kar] 1. Çox böyük və ciddi şeylər tələb edən, hər şeyə çox ciddi yanaşan; ciddi, zabitəli. *Tələbkar müəllim. Tələbkar sex rəisi.* – [Salman] *zəif və qorxaqlara özünü təpərli, tələbkar, amansız göstərirdi.* M.İbrahimov.

2. Bax **müddəi** 1-ci mənada. *Qazı qabaqca tələbkarı danışdırır.* "M.N.lətif."

**TƏLƏBKARLIQ** *is.* Tələbkar olma. *Özünə qarşı tələbkarlıq. – Mustafanın tələbkarlığı, işin ağası kimi tərpənməsi bütün az çalışıb çox qoparmaq istəyənlərin bəhanəsini kəsdi..* Mir Cəlal.

**TƏLƏBNAMƏ** *is.* [*ər.* tələb və *fars.* ...namə] Bir şeyin verilməsi və ya bir işin görülməsi, yaxud bir şəxsin müəyyən adamın sərəncamına göndərilməsi haqqında rəsmi xahiş (kağız). *Amerika qəzetləri yazırlar ki, buranın arvadlar cəmiyyəti hökumətə tələbnamə verib, dövlət qulluqlarında kişilər ilə bir ixtiyar sahibi olmaqlarını .. istəyirlər.* C.Məmmədquluzadə. *Sədr tələbnaməni oxuyub oturmadan karandaşın yaşıl tərəfilə yazdı..* S.Rəhimov.

**TƏLƏF** *is.* [*ər.*]: **tələf etmək (eləmək)** – məhv etmək, yox etmək, öldürmək, yoxa çıxarmaq. [Koroğlu:] *Şəhərə belə girsək, bizi tanıyar, uşaqları tələf eləyərlər.* "Koroğlu". *Ovları qorumaq lazımdır ki, hər ötən öz nadanlığına salıb, onları qırıb tələf eləməsin!* S.Rəhimov. **Tələf olmaq** – məhv olmaq, yox olmaq, ölmək. *Əcəb əyyam imiş əyyami-sələf; Gərək o günlərdə olaydıq tələf.* Q.Zakir.

**TƏLƏFAT** *is.* [*ər.* "tələf" söz. cəmi] Hərbi əməliyyat, təbii fəlakət, qəza və s. nəticəsində sıradan çıxan adam, əşya, maşın, tikili və s.; zayeat. *Müəllim Mirzə Əliqulu bizə dedi ki, zəlzələnin zərəri nəhayətdir, xah can tələfatı, xah zərəri.* C.Məmmədquluzadə. ☐ **Tələfat vermək** – hərbi əməliyyat nəticəsində canlı qüvvə cəhətdən zayeata uğramaq, itki vermək. [Zeynəb:] *Düşmən çoxlu tələfat verib qaçdı.* M.S.Ordubadi. *Vuruşma zamanı hər iki tərəf böyük tələfat vermiş*(*di*). S.Vəliyev.

**TƏLƏFFÜZ** *is.* [*ər.*] Bir hərfi və ya sözü, kəlməni söyləmə xüsusiyyəti, tərzi. *Tələffüz xatası. Aydın tələffüz. Düzgün tələffüz.* ☐ **Tələffüz etmək** – sözü, kəlməni düzgün və ya yanlış söyləmək, demək. ..[Dürrə] "*plankton*" *sözünü çətinliklə tələffüz etdi.* S.Vəliyev.

**TƏLƏFXƏRC** [*ər.*] bax **bədxərc**.

**TƏLƏFXƏRCLİK** bax **bədxərclik**. [Səttar bəy:] *Bu gör necə höcətdir ki, onların acığına qızıllarını satıb, daha da artıq tələfxərclik edir.* N.Vəzirov.

**TƏLƏKƏ** *sif.* Köhnə cır-cındır.

**TƏLƏM-TƏLƏSİK** *zərf* Tez, tələsik; tələsə-tələsə, əlüstü. *Mehman birtəhərlə tələm-tələsik aradan çıxdı.* S.Rəhimov. *Qadınlar tələm-tələsik tabağı, süfrəni, təndiri örtdülər.* Mir Cəlal.

**TƏLƏSDİRMƏ** "Tələsdirmək"dən *f.is.*

**TƏLƏSDİRMƏK** *f.* Bir işi tez görməyi xahiş və ya tələb etmək, işi tələsik gördürmək. *Rizvan Gülpərini tələsdirirdi.* S.Hüseyn.

**tələsə-tələsə** *zərf* Tələsik, tələsərək, tələm-tələsik, səbirsizliklə. *Aydın məcbur oldu ki, tələsə-tələsə öz plan və arzularını Kərimova danışsın.* H.Seyidbəyli.

**TƏLƏSİK** *zərf* Tələsə-tələsə, tez-tez, tələm-tələsik; tez, cəld. [Mərcan bəy] *tələsik*

*daxil olur, yaxşı geyinmişdir.* Ü.Hacıbəyov. *Şair tələsik qocadan ayrılıb, özünü içəri saldı.* Ə.Məmmədxanlı. // *sif.* Təcili, təxirsiz. *Əlimdə tələsik iş var.*

**TƏLƏSKƏN** *sif.* İş görərkən çox tələsən, səbirsizlik göstərən. *Tələskən adam.*

**TƏLƏSKƏNLİK** *is.* Tələsmə xasiyyəti; səbirsizlik, hövsələsizlik.

**TƏLƏSMƏ** "Tələsmək"dən *f.is.*

**TƏLƏSMƏDƏN** *zərf* Tələsməyərək, aramla, sakitcə, yavaş-yavaş, ağır-ağır. *Teymur tələsmədən ağır addımlarla yoluna davam etdi.* H.Seyilbəyli.

**TƏLƏSMƏK** *f.* Bir işi mümkün qədər tez, çapıq yerinə yetirməyə çalışmaq; səbirsizlik göstərmək, əcələ etmək. *Fərmanla Dilbər öz aralarında evlənmək işini danışıb qurtarsalar da, toy etməyə tələsmirdilər.* Ə.Sadıq. *Şamama aramla danışsa da, bir az tələsirdi.* Ə.Əbülhəsən. // Tez-tez, becid getməyə səy etmək, bir yerə tez çatmağa çalışmaq. *Evimizdən ayrılanda çox da tələsmirdim.* C.Məmmədquluzadə. *..Ağarza kəmərini bağlayıb .. tələsdi.* Mir Cəlal.

**TƏLƏT** *is.* [*ər.*] 1. Üz, sima.

2. Görkəm, zahiri görünüş.

3. Tülu etmə, çıxma (Günəş).

**TƏLX** *sif.* [*fars.*] 1. Acı.

2. *məc.* Pis.

**TƏLXƏK** *is.* 1. Keçmişdə: padşahların, feodalların saraylarında gülməli hərəkətləri və zarafatları ilə öz ağalarını və onların qonaqlarını əyləndirən şəxs. *Saray təlxəyi. – Təlxəklər bütün kələklərini meydana qoydular.* Çəmənzəminli.

2. Keçmişdə: meydanlarda, küçələrdə və s. yerlərdə gülməli nömrələr göstərən şəxs; oyunbaz. [Təlxək] *üzünə dəridən bir üzlük taxıb, aşağıda oyun çıxarar və yamsılamaqla pul yığardı.* H.Sarabski. // Adamları güldürən, əyləndirən, zarafatcıl adam. [Ədhəm] *istedadlı bir təlxək idi, həm özü gülürdü, həm də başqalarını güldürürdü.* M.Hüseyn. [Məsumə Firəngizə:] *Burax* [Köçərini] *getsin, təlxəyin birisidir, dilinə dil çatdıra bilməzsən.* B.Bayramov.

**TƏLXƏKLİK** *is.* 1. Təlxəyin işi, peşəsi (b a x **təlxək** 1-ci mənada). [Xan:] *Belə mirzələrin peşəsi təlxəklikdir.* S.Rəhimov.

2. Adam güldürmə, oyunbazlıq. *Təlxəklikdən əl çək!*

**TƏLİF** *is.*[*ər.*] Kitab tərtib etmə, əsər yazma.

**TƏLİQƏ** *is.* [*ər.*] Müəyyən məsələ haqqında rəsmi məktub. *Rüstəm bəy hirsindən təliqəni kənara atıb düşüncəyə daldı.* Çəmənzəminli. [Sədr] *dərkənar qoyulmuş təliqəni Dəmirova uzatdı.* S.Rəhimov.

**TƏLİM** *is.* [*ər.*] 1. Öyrətmə, dərs vermə, oxutma, tədris. *Zərdabi Azərbaycan dilində təlimə xüsusi diqqət verirdi.* □ **Təlim etmək (vermək)** – dərs vermək, öyrətmək. *..Balalara təlim vermək kimi uca bir vəzifəyə napaklıq yaraşmırdı.* Çəmənzəminli.

2. Qoşun və s. nizami bölmələrdə əsgərə döyüş və silah işlətmə üsul və qaydalarını öyrətmə; əsgəri məşq. *Atəş təlimi .. Topçuluq təlimi. – Böyük bir həvəslə bağlandı möhkəm; Hərbi təliminə, hərbi məşqinə.* M.Rahim. *Təlimdən yorğun-arğın və islanmış halda qayıdan əsgərlər çadırlara doldular.* Ə.Abasov. □ **Təlim vermək** – sirk və s.-də çıxış etmək üçün heyvanlara müxtəlif hərəkətlər öyrətmək. *Ayıya təlim vermək.* **Təlim keçmək** – təlimatçının rəhbərliyi altında məşq keçmək; öyrətmək. *Qarovul batalyonunda üç aydan artıq idi ki, təlim keçirdik.* Mir Cəlal.

3. Hər hansı bir sahə haqqında nəzəriyyə, nəzəri sistem, nəzəri müddəaların məcmusu. // Hər hansı bir alimin, mütəfəkkirin əsas müddəaları, görüşlərinin məcmusu, görüşlər sistemi. *H.Zərdabinin təbiət haqqındakı təlimi.*

**TƏLİMAT** *is.* [*ər.* "təlim" söz. cəmi] Bir şeyi həyata keçirmək üçün qayda və üsullar müəyyən edən yazılı göstəriş; əmrnamə. [Əbülhəsənov:] *Təlimatda, göstərişdə ayrı şeylər də yazılıb.* Ə.Vəliyev. *Divarlarda .. sitrus bitkilərinin becərilməsi haqqında təlimatlar asılmışdı.* H.Seyidbəyli.

**TƏLİMATÇI** *is.* 1. Dövlət, kooperativ və ya ictimai təşkilatların, öz tabeliklərində olan idarələrin və işçilərin fəaliyyətini yoxlayan və işi necə qurmaq haqqında onlara göstəriş verən işçisi. *Seçki günü camaat toplandı, mərkəzdən gələn təlimatçı nitq söylədi və nitqdə kəndin ümum qadınlarının seçkidə ciddi iştirakını tələb etdi.* B.Talıblı.

2. Müəyyən sənət, ixtisas öyrədən adam. *İstehsalat təlimi təlimatçısı. İdman təlimatçısı.*

**TƏLİMATÇILIQ** *is.* Təlimatçının işi. *Mədəd muzdurlar komitəsinin təlimatçılığı vəzifəsində çalışar, əsas etibarilə kulaklarla muzdurlar arasında şərtnamə bağlardı.* S.Rəhimov.

**TƏLİMATLANDIRMA** "Təlimatlandırmaq"dan *f.is.*

**TƏLİMATLANDIRMAQ** *f.* Bir işi necə görmək haqqında izahat vermək, təlimat vermək, rəhbər göstəriş vermək, öyrətmək. *Katib .. ayrılan on iki nəfəri təlimatlandırırdı.* Ə.Əbülhəsən.

**TƏLİMÇİ** *is.* Heyvanlara təlim verməklə məşğul olan adam. *..Ayı təlimçisi Valentin Filatovun çıxışları tamaşaçıları xüsusilə valeh edir.* "Bakı".

**TƏLİMNAMƏ** [*ər.* təlim və *fars.* ...namə] b a x **təlimat**. *Direktor zəngi basıb, hesabdardan təlimnaməni istədi.* Mir Cəlal. *Sənət məktəbinə qəbul haqqında təlimnaməni hələ də Üçtəpəyə göndərə bilməmişəm.* Q.İlkin.

**TƏLİS**[1] *is.* b a x **kisə**.

**TƏLİS**[2] *is.* Əl-üz dəsmalı.

**TƏLİS**[3] *is.* Əl-üzyuyan.

**TƏLİS**[4] *is.* Üstünə tut çırpılan iri parça.

**TƏLQİN** *is.* [*ər.*] 1. Hər hansı bir fikri, əqidəni, hissi qəbul etdirmək üçün birinin iradəsinə, psixikasına təsir etmə, beyninə yeritmə. *Tahir .. yenə qocanın mənalı-mənalı baxan, təlqin dolu gözlərini, qüvvətlə gurlayan səsini unutmurdu.* M.Hüseyn. ◻ **Təlqin etmək** – bir şeyi anladıb inandırmaq, beyninə yeritmək, qəbul etdirmək. *Çox həqiqət mənə təlqin eləyir vicdanım; Yoxdur ondan birini söyləməyə imkanım.* A.Səhhət. *Bu dayə pakürəkli, saf bir qadındı və bu saflığı ilə də Səməd bəyə düzlük və doğruluq təlqin eləmişdi.* Çəmənzəminli.

2. *din.* Müsəlmanlarda: meyit dəfn olunandan sonra molla tərəfindən məzar başında oxunan dua.

**TƏLQİNEDİCİ** *sif.* Bir şeyi birinə təlqin edən, inandırıb beyninə yeridən; inandırıcı. *..Bir ara susub durdum, sonra təlqinedici tövrlə sözümə davam etdim.* M.S.Ordubadi. *Bəkir öz güclü, təlqinedici səsi ilə ara vermədən ötür, nə isə sirli xəbərlər söyləyir..* İ.Hüseynov.

**TƏLL** *is.* Uzun təpə. [Bəxtiyar] *gözünü açanda gördü, doğrudan da bir təllin dibindədi. Yavaş-yavaş təllin başına çıxıb, gördü bir qalaça var.* (Nağıl). [Cəfərqulu xan:] *Qardaş, buyur, bu təllin üstünə çıx!* Ə.Haqverdiyev.

**TƏLLƏMƏ** "Təlləmək"dən *f.is.*

**TƏLLƏMƏK** *f. dan.* Uzun təpə kimi yığmaq. *Daşı təlləmək.*

**TƏLLƏNMƏ** "Təllənmək"dən *f.is.*

**TƏLLƏNMƏK** *məch.* Uzun təpə kimi yığılmaq, təpə əmələ gəlmək. *Dərənin içinə basdırılacaq payalar bir tərəfə çinlənir, qum ələnir, əhəng, torpaq bir qırağa təllənirdi.* Ə.Vəliyev.

**TƏLTİF** *is.* [*ər.*] 1. Yaxşı xidmətə və ya bir işdə fərqlənməyə görə orden, medal, fəxri ad, keçici bayraq, qiymətli şey və s. vermə. *Xəstəxanada yatdığının üçüncü günü* [Cavadı] *fərəhli bir xəbərlə – təltif xəbərilə təbrik etdilər.* Ə.Vəliyev. ◻ **Təltif etmək** – orden, medal, fəxri ad, keçici bayraq, qiymətli şey və s. vermək. *Kərimin fəaliyyətini qiymətləndirən komandanlıq onu "Qızıl Ulduz" ordeni ilə təltif etməyi qərara almışdı.* S.Rəhimov.

2. Həmin münasibətlə verilən orden, medal, fəxri ad, keçici bayraq, qiymətli şey və s.

**TƏM** [*ər.*] b a x **tam**[2]. *Dedi: – Meylin olurmu aluyə; Təmi meyxoş qızıl gəvaluyə?* M.Ə.Sabir.

**TƏMAS** *is.* [*ər.*] 1. Bir-birinə dəymə, toxunma. [Zeynal bıçağın] *itiliyini nümunə etmək üçün barmağı ilə tiyəsinə təmas etdi.* Çəmənzəminli. [Oğlan] *birdən Məryəmin qoluna təmas edib dayandı.* M.Hüseyn.

2. *məc.* Yaxınlıq, əlaqə. *Yelkən kimi ağardıqca qağayılar göy sularda; Dalğalarda təmas edir xəyalımın qanadları.* S.Rüstəm.

**TƏMAYÜL** *is.* [*ər.*] 1. Meyil. [Roza xanım:] *Eh, sizdə heç yüksəliş təmayülü yoxdur.* Çəmənzəminli. *Xədicənin bu fəlakətini evdə eşitdikdə ona qarşı məndə bir təmayül hissi oyandı.* S.Hüseyn.

2. *məc.* Partiyanın əsas xəttindən sapma, kənara çıxma.

3. Hər hansı bir ixtisaslaşma tərəfinə meyil, istiqamət. *Texnikumda üç təmayül üzrə dənizçi hazırlanır.*

**TƏMAYÜLÇÜ** *is.* Partiyanın əsas xəttindən sapan, kənara çıxan, təmayülçülüyə meyil göstərən adam. *Bizə lazımmı təmayülçülərin falçılığı? Nə deyirlərdi, beşillik yetirilməz yerinə!* M.Müşfiq.

**TƏMAYÜLÇÜLÜK** *is.* Partiyanın əsas xəttindən kənara çıxmağa meyil göstərmə.

**TƏMAYÜLLÜ** *sif.* Müəyyən ixtisaslaşmaya meyil göstərən; ixtisaslaşan. *Riyaziyyat təmayüllü orta məktəb.*

**TƏMƏL** [*ər.*] 1. Bünövrə, özül. *Binanın təməli. Divarın təməli.* – [Yusif:] *Evlər təməlindən yıxılıb, qalmadı bir dam.* H.Cavid.

2. *məc.* Bir şeyin əsası, kökü. *Mənə bir qocaman dağı andırır; Eşqimin təməli şəhərim Bakı.* S.Rüstəm. ☐ **Təməlini (təməl daşını) qoymaq** *məc.* – əsasını qoymaq.

**TƏMƏLLİ** *sif.* Bünövrəli, özüllü, əsaslı.

**TƏMƏLSİZ** *sif.* Təməli olmayan, bünövrəsiz, özülsüz, əsassız.

**TƏMƏNNA** *is.* [*ər.*] 1. Arzu, istək, dilək, xahiş. *Bəxti-mənhusimə bax, mən bu təmənnada ikən; Şişməyə başladı indi üzü qarə cigərim.* M.Ə.Sabir. *Var idim çoxdan ol təmənnadə; Dolaşaydım çıxıb bu səhradə.* A.Səhhət. ☐ **Təmənna etmək** – rica etmək, xahiş etmək. *Vaqif durnalardan təmənna eləyir ki, intizarını çəkdiyi və sorağında olduğu alagözlü həmdəmdən, görsünlər, ona bir xəbər .. gətirə bilərlərmi?* F.Köçərli. [Şamo:] *Mən özüm şəxsən sizdən heç bir şey təmənna etmirəm.* S.Rəhimov.

2. Müəyyən məqsədlə edilən yaxşılıq, kömək. *O heç bir kəsin təmənnasını qəbul etmir.* Ə.Vəliyev. // Arzu olunan şey, tələb, məqsəd. [Pristav Mürsələ:] *Sənin Turaclıya nə təmənna ilə gəldiyin də mənə məlumdur.* Ə.Vəliyev.

**TƏMƏNNASIZ** *sif.* Özü üçün bir məqsəd, fayda, mənfəət güdməyən. *Təmənnasız yardım. – Bəli, xalqdan böyük dayaq yoxdur, – deyib Şərəfoğlu qocanın sözünü təsdiq etdi, – xalq təmənnasız dostdur, ədalətlidir.* M.İbrahimov. // Zərf mənasında. *Siz də təmənnasız buyurun hər an; Bu sənət bağımdan gül-çiçək dərin.* S.Rüstəm. [Rəşid:] *Qəribə idi ki, mənim üçün bu qədər sonsuz və təmənnasız qayğı göstərən* [Bəyim xala] *Canbalayevlərin qapısını bir dəfə də açmamışdı.* İ.Hüseynov.

**TƏMƏRKÜZ** *is.* [*ər.*] Mərkəzləşmə, mərkəzləşdir(il)mə. // Bir yerə toplanma, yığılma, cəmləşmə.

**TƏMƏRKÜZLƏŞDİRİLMƏ** "Təmərküzləşdirilmək"dən *f.is.*

**TƏMƏRKÜZLƏŞDİRİLMƏK** *məch.* Bir yerə toplaşdırılmaq, yığışdırılmaq, cəmləşdirilmək.

**TƏMƏRKÜZLƏŞDİRMƏ** "Təmərküzləşdirmək"dən *f.is.*

**TƏMƏRKÜZLƏŞDİRMƏK** *f.* Bir yerə toplaşdırmaq, yığışdırmaq, cəmləşdirmək. *Sənayeni təmərküzləşdirmək.*

**TƏMƏRKÜZLƏŞMƏ** "Təmərküzləşmək"dən *f.is. Kapitalın təmərküzləşməsi.*

**TƏMƏRKÜZLƏŞMƏK** *f.* Bir yerə toplanmaq, yığılmaq, cəmləşmək.

**TƏMƏSSÜK** *is.* [*ər.*] b a x **veksel**. *Kağızları da yoxladıq, bunlar pul təməssükləri, mülk qəbalələri və sair lazımsız kağızlardı.* M.S.Ordubadi. [Əbdüləli bəy:] *Balaş, sizin təməssükün vaxtı dünən qurtarmışdır.* C.Cabbarlı.

**TƏMHİD** *is.* [*ər.*] *köhn.* 1. Yayma, döşəmə.

2. Nizama salma.

3. Hazırlıq.

**TƏMİM** *is.* [*ər.*] 1. Ümumiləşdirmə.

2. Yayma, paylama.

**TƏMİN** *is.* [*ər.*] Adətən "etmək", "edilmək" köməkçi feilləri ilə – 1) bir şeylə lazımi dərəcədə təchiz etmək, lazım olan bütün şeyləri vermək. [Xacə Nizam:] *Bir də kaşanə gərək məsrəf üçün; Hər nə lazımsa edərlər təmin.* H.Cavid; 2) inandırmaq, qane etmək. *Bu cavab Salamı təmin etmirdi.* Mir Cəlal; 3) bir şeyi həyata keçirmək üçün lazımi şərait yaratmaq. [Midhət Münir bəyə:] *Şuraların yardımı ilə istiqlaliyyətimizi təmin və ingilisləri məhv edəcəyik.* Çəmənzəminli.

**TƏMİNAT** *is.* [*ər.* "təmin" söz. cəmi] 1. Birisinin həyatını təmin etmək üçün ona verilən pul, maddi vəsait və s. *Aslan da düşünərək, çalışaraq ailəsinə təminat yolu tapmışdı.* A.Şaiq.

2. Bir şeyin qorunub saxlanmasını, yerinə yetirilməsini, həyata keçirilməsini təmin edən amillər; zəmanət. *Eyvazın dəstənin başında durması mənim üçün bir təminatdır.* C.Cabbarlı.

**TƏMİNATLI** *sif.* Təminatı olan, təmin edilmiş. *Təminatlı əmək haqqı.*

**TƏMİNEDİCİ** *sif.* Təmin edən, qane edən, razı salan. *Təminedici cavab. Təminedici izahat.*

**TƏMİR** *is.* [*ər.*] Bir şeyin xarab olmuş, sınmış, dağılmış, sökülmüş yerini düzəltmə, qaydaya salma. *Ayaqqabı təmiri. Təmir emalatxanası. – Traktorçular traktor təmirinə məşğuldular*. M.İbrahimov. *Bu maşını cüzi təmirdən sonra hərəkətə gətirmək olardı.* B.Bayramov. □ **Təmir etmək** – 1) bir şeyin xarab olmuş, sınmış, sökülmüş yerini düzəltmək. *Evi təmir etmək. Yolu təmir etmək. – Ev sahibi evin qədrini bilsə, görər ki, ev uçacaq və elə ki, gördü uçacaq, başlar təmir eləməyə*. C.Məmmədquluzadə. [Rəhim:] *Bizim işimiz depoda parovoz təmir etmək idi.* Ə.Sadıq; 2) *köhn.* tikmək, bina etmək. *Bir də gördün ki, eyləyib tədbir; Bir gözəl xanə etdilər təmir.* S.Ə.Şirvani.

**TƏMİRARASI** *sif. xüs.* Təmirlər arasında olan, həyata keçirilən. *Neft quyusunun təmirarası işləmə müddəti*. – [Mehriban:] *Məsələn, sən öz sexində təmirarası müddəti nə qədər uzatmısan?* H.Seyidbəyli.

**TƏMİRAT** [*ər.* "təmir" söz. cəmi] *klas.* 1. *is.* Təmir, təmir işləri. [Rüstəm bəylə Çingiz] *yanğından saxlanılmış, xırda təmiratla alayarımçıq süs verilmiş bir otağa girdilər.* Çəmənzəminli. [Həmid Əlyarov:] *Yoldaşlar, bu təmiratı hələlik təxirə salmalısınız*. M.Hüseyn.

2. *top. köhn.* Binalar, tikililər. [Xortdan:] *Təmirat hamısı oddandır*. Ə.Haqverdiyev.

**TƏMİRÇİ** *is.* Təmir işi ilə məşğul olan fəhlə. *Təmirçi çilingər. Yeraltı təmirçilər.*

**TƏMİRXANA** *is.* [*ər.* təmir və *fars.* ...xanə] Təmir işləri aparılan emalatxana. – [Sədr:] *Amma Hüseynqulunun Təzə şəhərdə bir mexaniki sex düzəltməyi, təmirxana, dəmirçixana qurmağı mənim üçün bilirsən nə olar?* Mir Cəlal.

**TƏMİZ** *sif.* və *zərf* 1. Çirk olmayan, kirli olmayan, ləkəli olmayan, çirklənməmiş, kirlənməmiş, yuyulmuş. *Təmiz yaylıq. Təmiz dəsmal. – Feldşerin peşkəş verdiyi təmiz xalat* [Mahirəyə] *çox gözəl yaraşırdı*. M.Hüseyn. *Kəniz Həlimə içəri girib, dəyirmi stolun üstünə təmiz süfrə saldı*. Ə.Abasov. // Silinib təmizlənmiş, süpürülüb təmizlənmiş, səliqəli. *Təmiz otaq. – Adamlar daş pilləkənlərdən təmiz küçəyə enəndə qırılmış boyunbağı kimi səpələnib dağılırdılar.* Mir Cəlal. *Bizim iş yerimiz təmiz olmalıdır, maşınlarımız vaxtında yağlanıb təmizlənməli, üst-başımız da silinmiş maşın kimi parıldamalıdır*. Ə.Sadıq.

2. Məharətlə, ustalıqla, dəqiq və səliqəli görülmüş, düzəldilmiş, qayrılmış, heç bir qüsuru olmayan. *Təmiz iş.*

3. Sonuncu dəfə üzü köçürülmüş, səhvi düzəlmiş, pozulmuş yerləri olmayan. *Təmiz yazı. Təmiz səhifələri gözdən keçirmək.*

4. Doldurulmamış, yazı, şəkil və s. üçün istifadə edilməmiş, yazılmamış. *Təmiz blank. Təmiz kağız*. // Üzərində çil, sızanaq və s. olmayan. *Təmiz dəri. Təmiz üz*. // Zərf mənasında. *Tərtəmiz. Məzlum .. üzünü təmiz qırxdı, xırım-xırda şeylərini və skripkasını yerbəyer edib çamadana yığdı*. S.Vəliyev. // Dumansız, buludsuz, açıq-aydın. *Təmiz fəza*. – *Musa kişi Firəngizin başı üstündəki təmiz göyə baxa-baxa qalxırdı*. B.Bayramov.

5. Qarışığı olmayan və ya çox az olan; xalis. *Təmiz qızıl. Təmiz spirt. Təmiz qum.* // Bulanıq olmayan. *Təmiz su*. // Alaqsız, alağı olmayan. *Təmiz bostan*. // Təmizqanlı, cinsi təmiz, cins (heyvanlar haqqında).

6. Müəyyən qaydalara, normalara uyğun gələn; düzgün (dil, üslub və s. haqqında). *Ərəbcə təmiz* (z.) *danışmaq*. – *Aslan slovencə hələ təmiz danışa bilmirdi, ancaq hər şeyi başa düşürdü*. S.Vəliyev.

7. *məc.* Mənəvi cəhətdən nöqsansız, qüsursuz; heç bir pis niyyəti, qərəzi olmayan; doğruçu, namuslu. *Təmiz adam. – Mirzənin təmiz qulluqçu olmağına qiymət qoyurdular və yoldaşları da onu çox istəyirdilər*. Ə.Haqverdiyev. *Novruzəli və Usta Zeynallar daxilən çox təmiz və xoşniyyət adamlardır*. M.İbrahimov. // Yüksək mənəviyyata əsaslanan; ülvi, pak. *Təmiz sevgi. – Təmiz və pak məhəbbətlə isinən qadın yatağı müqəddəsdir*. M.İbrahimov. // Məsum, bakir, bəkarətli, ləkələnməmiş, korlanmamış. *Təmiz qız*. – [Mirzağa] *Cəmilə kimi təmiz, munis, eyni zamanda gözüaçıq, gözəl bir qız haradan tapacaqdı*. S.Hüseyn.

8. Bir şeyi çıxdıqdan sonra qalan, alınan. *Təmiz çəki* (*əmtəənin qabsız çəkisi*). *Təmiz gəlir* (*xərc və vergiləri çıxdıqdan sonra qalan gəlir*). // Tamamilə, büsbütün, tam. *Nurəddinin ayağı təmiz sağalmışdı*. S.S.Axundov. *Eldarın etdiyi söhbətlər, xüsusən çalıb-oxumağı*

*ovu təmiz yadımdan çıxarmışdı*. M.Rzaquluzadə.

**TƏMİZCƏ** *sif.* və *zərf* 1. Çox təmiz, lap təmiz; təmiz. [Seyid:] [Mehmanxanada] *təmizcə, pakizə müsəlman nömrələri saxlayıram*. Ə.Haqverdiyev.

2. Tərtəmiz. [Musanın nəvəsi] *..şalvar cibindən çıxardığı ağappaq bir yaylıqla səhənglərinə bulaşan qatığı təmizcə sildi.* Qantəmir.

**TƏMİZCİNSLİ** b a x **təmizqanlı**.

**TƏMİZKAR** *sif.* Təmizliyi, səliqəni sevən. *Təmizkar qadın. – Ataş görürdü ki, Mirzə Cəmil çox təmizkar, səliqəni sevən adamdır.* Ə.Vəliyev.

**TƏMİZKARLIQ** *is.* Təmizkar adamın xasiyyəti, təmizkar olma. [Feodor İvanoviç Rüstəm bəyə:] [Xanım] *sizin təmizkarlığınızı isə çox bəyənir, mənə həmişə məmnuniyyətlə söyləyir..* Çəmənzəminli.

**TƏMİZQANLI** *sif.* Qarışığı olmayan, cins, təmizcinsli (ev heyvanları haqqında). *Təmizqanlı Qarabağ atı. – Əmtəə fermalarında naxırın təmizqanlı, yəni təmizcinsli heyvanlardan ibarət olması vacib deyildir*. A.Ağabəyli.

**TƏMİZQƏLBLİ** b a x **təmizürəkli**. *Təmizqəlbli adam.*

**TƏMİZLƏMƏ** "Təmizləmək"dən *f.is.*

**TƏMİZLƏMƏK** *f.* 1. Çirkini, ləkəsini yumaq və ya başqa yolla aparmaq, təmiz etmək; təmizləmə işi aparmaq. *Ayaqqabının palçığını təmizləmək. – Quşlar yuvalarında oturub dimdiklərini təmizləyirdilər*. N.Nərimanov. // Tərkibcə təmiz etmək, başqa şeyin qarışığından azad etmək. *Qazı təmizləmək. Otağın havasını təmizləmək.* // Çırpmaq, püfləmək və s. yolla üzərindəki tozdan, qardan və s.-dən təmiz etmək. *..Marallarım .. moizə kitablarını rəfdən alıb, tozlarını təmizləyib başlayırlar əzbərləməyə.* Ə.Haqverdiyev. [Xosrov] *əl-qolunu atıb qarı təmizlədi.* B.Bayramov. // *məc.* Korlayan, xarab edən, pozan, yad ünsürlərdən azad etmək, təmiz etmək. *Dili ehtiyac olmadan işlədilən yabançı sözlərdən təmizləmək*. // *məc*. Mənəvi cəhətdən təmiz etmək. *Əziz balalar! Bizə yemək-içməkdən başqa, ruhumuzu təmizləmək, ağlımıza sığal vermək lazımdır*. N.Nərimanov.

2. Üz hissəsini, qabığını və s.-ni soyub atmaq, kənar etmək. *Kartofu təmizləmək. Balığı təmizləmək. Yumurtanı təmizləmək.*

3. Bir yerdən artıq, lazımsız, kənar şeyləri götürmək. *Stolun üstünü təmizləmək. Otağı artıq şeylərdən təmizləmək*. // Üstündəki lüzumsuz, mane olan şeylərdən azad etmək. *Yolu təmizlədilər. Bir dəstə soldat Montini qazamatdan məhkəməyə gətirirdi*. M.S.Ordubadi.

4. Bir yeri düşməndən, arzu edilməyən kənar adamlardan azad etmək. *Səhər açılanda bizim hissələr cəbhənin bu sahəsini tamamilə düşməndən təmizlədilər.* M.İbrahimov.

5. Yığışdırmaq, sil-süpür etmək. *Otağı təmizləmək. – Hər gün saat beşdə doktorgildən qayıdan Xavər evi təmizlər, xörək hazırlar, çay qoyar*(*dı*). M.İbrahimov.

6. *məc. dan.* Nə varsa hamısını aparmaq, oğurlamaq. *Oğrular evi təmizləmişdilər*.

7. *məc.* İçində olan şeyin hamısını yemək, yeyib qurtarmaq. *Kasanı təmizləmək.*

**TƏMİZLƏNMƏ** "Təmizlənmək"dən *f.is.* [Sarıköynəyə] *yardım olmaq üçün otağımın süpürülüb təmizlənməsini ona tapşırar, zəhmət haqqı verərdim*. S.Hüseyn.

**TƏMİZLƏNMƏK** "Təmizləmək"dən *məch. Ev süpürülüb təmizləndi*. – [Maya] *kifayət qədər hərəkət etdikdən sonra yuyundu, təmizləndi*. M.İbrahimov.

**TƏMİZLƏYİCİ** *is.* və *sif.* Bir şeyi təmizləmək üçün cihaz, qurğu və ya maddə. *Avtomaşının təmizləyicisi. Təmizləyici qurğu.*

**TƏMİZLİK** *is.* 1. Təmiz şeyin halı. *Otağın təmizliyi. Köynəyin təmizliyi. Qab-qacağın təmizliyi. – Siniflərin geniş və təmizliyi, laboratoriya və kabinələrin mükəmməlliyi ..* [səyyahların] *heyrətinə səbəb oldu*. Çəmənzəminli.

2. Saflıq, qarışıqsızlıq, xalislik. *Suyun təmizliyi. Havanın təmizliyi*.

3. *məc.* Mənən nöqsansızlıq; saflıq, düzlük, paklıq. *Ana zəifdir, lakin dünyanın güclüləri və zalımlarının hiyləgərliyi və fırıldaqçılığına qarşı onun qüdrətli silahı təmizlik və düzlükdür.* M.İbrahimov.

**TƏMİZÜRƏKLİ** *sif.* Ürəyi təmiz, safqəlbli, səmimi. *Təmizürəkli adam. – Həlim, mehriban, təmizürəkli Gülbadam birdən-birə şirə döndü.* N.Nərimanov. [Vahid] *təmizürəkli, qızğıntəbiətli, mərd və məğrur oğlan idi.* İ.Hüseynov.

**TƏMKİN** *is.* [*ər.*] 1. Özünü ələ ala bilmə bacarığı, soyuqqanlılıq, özünü itirməmə; ciddilik, ağırlıq, vüqar. *Yazıçı heç zaman öz müvazinətini, təmkin və sakitliyini itirmir.* M.İbrahimov. [Fərman və Cəmilin] *danışıqlarında, hərəkətlərində bir təmkin nəzərə çarpırdı.* Ə.Sadıq.

2. **Təmkinlə** şəklində *zərf* – vüqarla, ciddi surətdə, özünü itirməyərək, soyuqqanlılıqla, öz halını pozmadan. *Qafar təmkinlə öz fikrini anlatdı.* Ə.Sadıq. *Mürsəl nə qədər odlu danışırdısa, Ataş bir o qədər toxdaq və təmkinlə cavab verməyə can atırdı.* Ə.Vəliyev.

**TƏMKİNLİ** *sif.* və *zərf* Ağır, ağır sanballı, vüqarlı; özünü ələ ala bilən, özünü itirməyən, halını pozmayan. *Təmkinli adam. – Yapıncılı kişi çox mülayim və təmkinli danışırdı.* Ə.Vəliyev. *Qaranlıqdan Azadın sakit və təmkinli səsi eşidildi.* Ə.Məmmədxanlı.

**TƏMKİNLİLİK** *is.* Təmkinli olma, vüqarlılıq, ağırlıq, vüqar, soyuqqanlılıq. *Mehdizadə çox vaxt dostunun zarafatlarına davam gətirməyib təmkinliliyini itirir.* Y.Əzimzadə.

**TƏMRİN** *is.* [*ər.*] 1. Təkrar etdirə-etdirə alışdırma, öyrətmə; təkrar edə-edə alışma, öyrənmə. // Bu məqsədlə şagird və ya tələbəyə verilən misallar və bu misallardan ibarət kitab, dərslik.

2. Bəzi idman növlərində (gimnastika, atletika və s.) icra edilən ayrı-ayrı hərəkət.

**TƏMSİL** *is.* [*ər.*] 1. Bənzətmə, oxşatma, təşbeh. □ **Təmsil etmək** – birinin müvəkkili olmaq, bir işdə onu əvəz etmək, onun adından danışmaq; birinin mənafeyini, fikrini, görüşünü və s.-ni ifadə etmək. *Xalqın mənafeyini təmsil etmək. – Bosforda lövbər atıb dayanmış iki gəmi; Hərəsi təmsil edir bir yurdu, bir aləmi.* N.Rəfibəyli.

2. *ədəb.* Adamları və onların əməllərini eyhamlı şəkildə təsvir edən, əksərən mənzum, nəsihətamiz qısa ədəbi əsər. *Zakirin təmsilləri.* "*Ağacların bəhsi*" *təmsili. Krılovun təmsilləri.* // *köhn.* Tamaşa, pyes, səhnə üçün yazılmış əsər (bu mənada əsasən toplu – "təmsilat" şəklində işlənmişdir). *Biz qurban bayramı münasibətilə gərək teatr hazırlayaq, götürürük Mirzə Fətəli Axundzadənin təmsilatı ki ibarət olsun,* "*Sarab xanının vəziri*" *komediyasından.* S.Rəhman.

**TƏMTƏRAQ** *is.* [*ər.*] Dəbdəbə, təntənə, calal. *Mədinə təmtərağı və israfı sevməzdi.* M.İbrahimov. *Heç vaxt aldatmasın təmtəraq səni; Zəhmətlə şöhrətə çatar hər insan.* B.Vahabzadə.

**TƏMTƏRAQLI** *sif.* Dəbdəbəli, təntənəli, calallı. [Ağbulaq kəndində] *bu mədəniyyət sarayı .. təmtəraqlı bir kaşanə kimi ucalmışdı.* S.Rəhimov. // Zahirən çox bəlağətli və parlaq. *Təmtəraqlı nitq. Təmtəraqlı ibarələr.* – [Mühərrir:] *Belə təmtəraqlı sərlövhələr oxucuları cəlb edir.* S.Vəliyev.

**TƏMYİZ** [*ər.*] *köhn.* bax **kassasiya**.

**TƏN¹** *sif.* və *zərf* Ölçü, boy və s. cəhətdən başqası ilə eyni olan; bərabər. *Dost dost ilə tən gərək; Tən olmasa, gen gərək.* (Məsəl). *Qalxdın şahin kimi üfüqlərlə tən; Vuruldun öz ana torpağına sən.* N.Xəzri. // Lap, düz, tam. *Cəfərin atası kömürçülüklə qazandığı pulun tən yarısını hər ay müntəzəm halda oğluna göndərmiş, onu oxutmuşdu.* Ə.Vəliyev. [Yazgül:] *Tikanlı məftilin tən ortasında iri bir doqqaz var.* Ə.Məmmədxanlı. □ **Tən gəlmək** – tam uyğun gəlmək, bərabər olmaq, düz gəlmək. [Rəşid:] *Bu barədə mənim köhnə dostum Qəhrəman müəllimlə də fikrimiz tən gəlir.* S.Rəhimov. [Qadir:] *Yoldaş Bülənd, sənnən mən elə tən gələrik..* Ə.Əbülhəsən.

**TƏN²** *is.* [*fars.*] *klas.* Bədən. *Can əgər çıxsa tənimdən əsəri-mehrin ilə; Əsəri-mehrini sanman ki, çıxar canımdan.* Füzuli. *Deşik-deşik olur nər bədənləri; Döşənir torpağa aslan tənləri.* H.K.Sanılı.

**TƏN³** [*ər.*] *klas.* bax **tənə** 1-ci mənada. *Alma ağacı dibində sayə; Tən eylər idi bulud da Ayə..* Xətayi. *Mənə tən eyləyən qafil səni görcək utanmazmı?* Füzuli. *Gözəlliklər yapma, duyğular cansız; Mənə tən eyləyir hər yetən qansız.* Ə.Cavad.

**TƏNASÜB** *is.* [*ər.*] Uyğunluq, mütənasiblik; aralarında uyğunluq və münasiblik olma, bir-biri ilə tutma, bir-birinə yaraşma. [Qızın] *dalğın baxışı, vücudunun tənasübü hər kəsi .. özünə baxmağa məcbur edərdi.* S.Hüseyn. *Mehriban çox gec-gec gülümsəyir, gülümsəyəndə də üzündəki tənasüb pozulur.* H.Seyidbəyli.

**TƏNASÜBSÜZ** *sif.* Tənasübü, uyğunluğu olmayan; əndazəsiz, uyğunsuz.

**TƏNASÜBSÜZLÜK** *is.* Tənasüb, uyğunluq, əndazə olmadığı hal; uyğunsuzluq, əndazəsizlik.

**TƏNASÜX** *is.* [*ər.*] 1. Ruhun bir bədəndən başqasına, bəzən insandan heyvana və əksinə keçməsi.

2. Qurdun (həşərat) kəpənəyə çevrilməsi kimi dəyişmələr. *Barama qurdu vaxtı çatanda kəpənəyə dönür.*

**TƏNASÜL** *is.* [*ər.*] 1. Nəsil yetişdirmə; doğub-törəməklə artma.

2. Qadın və kişilərdə cinsiyyət üzvü.

**TƏNAVÜL** *is.* [*ər.*] Yemək-içmək, qidalanma, xörək.

**TƏNBEH** *is.* [*ər.*] Məzəmmət, danlama, danlaq. *Pərşan pis bir tənbeh eşidəcəyi duyğusu ilə anasının qoluna qısıldı.* M.İbrahimov. □ **Tənbeh etmək (eləmək)** – məzəmmət etmək, danlamaq. *Uşağı tənbeh etmək.* – [Hacı Bayram:] *Günahım varsa tənbeh eləyin, yox isə qalım burada.* Ə.Haqverdiyev. // Ümumiyyətlə, cəza. [Hökumət] *kəndlərdə tənbeh üçün qazaq qoyurdu.* E.Sultanov. *Xırda işlərdən ötrü suda düşən işlər və yüngül tənbehlərin hamısı manifestə düşür.* C.Məmmədquluzadə. □ **Tənbeh etmək (eləmək)** – cəzalandırmaq. *Uşağı nadinclik üstündə tənbeh etmək. – Bayraməli arvadının qaçmağından xəbərdar olub, ona tənbeh eləmək üçün tutub, əl-ayağını bağlayıb sabahadək döyür, bir neçə dəfə də əlindəki xəncərlə başını kəsmək istəyir.* Çəmənzəminli.

**TƏNBƏKİ** *is.* Çəkilmək üçün papiros, siqaret, çubuq və s.-yə doldurulan xırda doğranmış tütün yarpağı. [Hacı Qara:] *..Dəxi kisədə tənbəki yoxdur.* M.F.Axundzadə. *Qarakişi .. iri-iri doğrayıb cibinə yığdığı qəzetdən bir parça çıxarıb arasına ovma tənbəki doldurdu.* B.Bayramov.

◊ **Başına tənbəki oyunu açmaq** – b a x **baş**.

**TƏNBƏL** *is.* və *sif.* Tənbəllik edən; işdən, zəhmətdən qaçan; işləməyi, zəhməti sevməyən (adam). *Tənbəl adam. Tənbəl uşaq. – İşdən ötrü ki getmədi tənbəl; İşinin axırı olar əngəl.* A.Səhhət. *Mədəd* "*tənbəl*" *sözünü deyəndə Güldanəyə elə gəldi ki, onu ilan çaldı.* Ə.Vəliyev. // İşdə ağır tərpənən, ağır yeriyən, ağır hərəkət edən. *Tənbəl heyvan.*

◊ **Bağdad tənbəli, tənbəli-Bağdad** – çox tənbəl, heç bir iş görmək istəməyən, işləməklə arası olmayan adam haqqında. *Olmuşuq misli-tənbəli-Bağdad; Edirik cümlə bəxt əlindən dad.* S.Ə.Şirvani.

**tənbəl-tənbəl** *zərf* Tənbəlcəsinə, həvəssiz, könülsüz. *Həyətdə Cəfər əminin fiti və tənbəl-tənbəl atılan addımlarının səsi eşidilirdi.* H.Nəzərli. *..Tox inəklər quyruqlarını bulaya-bulaya tənbəl-tənbəl yeriyirdilər.* İ.Hüseynov.

**TƏNBƏLCƏSİNƏ** *zərf* Tənbəl-tənbəl, laqeydcəsinə.

**TƏNBƏLLƏNMƏ** "Tənbəllənmək"dən *f.is.*

**TƏNBƏLLƏNMƏK** *f.* Tənbəllik etmək, tənbəl olmaq, tənbəlləşmək. *Usta geri dönməyə tənbəllənib, eşşəyin altından zorla keçib getdi.* Çəmənzəminli.

**TƏNBƏLLƏŞMƏ** "Tənbəlləşmək"dən *f.is.*

**TƏNBƏLLƏŞMƏK** b a x **tənbəlləşmək**. *..Əmioğlum tənbəlləşib, getmək istəmirdi.* C.Məmmədquluzadə.

**TƏNBƏLLİK** *is.* 1. Tənbəl adamın hal və keyfiyyəti. *Kim ki tənbəlliyə məhəbbət edər; Daim əyləncələrlə ülfət edər.* M.Ə.Sabir. [Sevinc Mahmuda:] *Səni kəndə qaçmağa məcbur edən tənbəllikdir.* Z.Xəlil.

2. Başısoyuqluq, səhlənkarlıq. [Qulu:] *Etiraf etməliyik ki, idarə bir az tənbəllik göstərir.* Çəmənzəminli. [Prokuror Firəngizə:] *Görünür, hələ tənbəllikdən yaxamızı tamam qurtara bilməmişik.* B.Bayramov.

**TƏNBUR** *is.* [*ər.*] Armudvari çanağı olan qədim Şərq simli musiqi aləti. *Tənbur ilə telli sazı; Qabaqlaşıb çalaq barı.* S.Vurğun.

**TƏNDİR** *is.* Çörək yapmaq üçün gildən düzəldilən konusşəkilli, üstü kəsik, yerə qoyulub ətrafı səki kimi tikilən və ya yerə basdırılan iri kürə. *Təndirdə çörək yapmaq. Təndir çörəyi* (*təndirdə bişmiş yastı çörək*). – [Adil:] *Təndirdən yenicə çıxmış isti çörəkləri götürüb alverə yollandım.* B.Bayramov. □ **Təndir salmaq** – çörək bişirmək üçün təndirə odun qoyub yandırmaq. [Gülsüm:] *Kişi, nə vurmusan özünü yerə, dur, bir az odun yar, təndir salacağam.* C.Cabbarlı.

**TƏNDİRXANA** *is.* Təndirin yerləşdiyi yer, tikili. [Məhəmmədəli:] *Təndirxana uçmuşdu, onu qayırmışam.* N.Vəzirov. *Həyətin ortasın-*

*da üstü taxtapuşlu təndirxana görünürdü.* Ə.Vəliyev.

**TƏNDÜRÜST** *sif.* [*fars.*] Bədəncə heç bir nöqsanı, şikəstliyi olmayan, bədəncə sağlam; gümrah. *Təndürüst adam. –* [Dostumun] *rast və gözəl qaməti əyilib, rəngi soluxub, ..qərəz, canı-başı salamat, təndürüst və müqtədir bir halda ikən, indi çox həqir və məyus görünürdü.* F.Köçərli.

**TƏNDÜRÜSTLÜK** *is.* Təndürüst adamın hal və keyfiyyəti; bədənin hər cür nöqsan və şikəstlikdən salamat olması; sağlamlıq. *Uşağın təndürüstlüyü.*

**TƏNƏ** [*ər.*] 1. *is.* Danlaq, məzəmmət. [Çopo:] *Ceynizin gülüşündə mənim keçmiş ənənəpərəstliyimə qarşı bir tənə duydum.* Çəmənzəminli. *Xanpərinin ucundan* [Mədədin] *üzü çoxlu danlaq yeyib, qulağı hədsiz tənələr eşidibdir.* Ə.Vəliyev. □ **Tənə etmək** – danlamaq, məzəmmət etmək. *Axır elə oldum rüsvayi-aləm; Düşmən tənə eylər, dost qınar məni.* Q.Zakir. // Birisinin gizli işini, nöqsanını, eybini və s. xoşagəlməz cəhətlərini üzünə vurma, demə, tən. □ **Tənə etmək (vurmaq)** – birisinin gizli işini, nöqsanını, eybini və s. xoşagəlməz cəhətlərini üzünə vurmaq, demək.

2. *sif.* Tənəli. *Ov gəlsə ötürmərəm; Tənə söz götürmərəm; Yüz il ömrümdən keçsə; Səndən əl götürmərəm.* (Bayatı). *Çəkilib pünhana, deyir, dərdə döz; Cəhənnəm odundan pisdi tənə söz.* Aşıq Ələsgər.

**TƏNƏFFÜS** *is.* [*ər.*] 1. Canlı orqanizmlərdə oksigeni udma və karbonu buraxma prosesi. *Tənəffüs üzvləri.* // Ciyərlərin havanı alıb buraxması; nəfəsalma və nəfəsvermə. *Təri soyuduqca bədəni ağırlaşan qocanın tənəffüsü də çətinləşir, .. sinəsindən bir xırıltı qopurdu.* B.Bayramov.

2. Məktəbdə dərslər arasında fasilə. *Sabahı günü böyük tənəffüs zamanı müdir məktəbin həyatinə çıxdıqda şagirdlərin bir yerə toplandığını gördü.* S.Rəhman. *Tələbələr tənəffüs vaxtı kağız rəflərinə yanaşır, gələn məktubları nəzərdən keçirirdilər.* B.Bayramov.

3. İstirahət üçün işin müvəqqəti olaraq dayandırıldığı müddət, işin müvəqqəti dayandırılması ilə başlanması arasındakı vaxt; fasilə, ara. *Manqanın qızları o qədər həvəs və səylə işə girişmişdilər ki, çox zaman Şamama tarladan onları tənəffüsə güclə çıxarırdı.* İ.Əfəndiyev.

**TƏNƏK** *is.* Üzüm ağacı, meynə. *Tənək əkmək. – Salxım-salxım olacaqdır ağ üzümü tənəklərin; Yelinləri dolacaqdır yenə sağmal inəklərin.* S.Vurğun. *..Quma yatan tənəkləri sanki ağır, iri salxımlar çəkib yerə yapışdırmışdı.* Mir Cəlal.

**TƏNƏKƏ** *is.* Nazik dəmir təbəqəsi. *Tənəkə parçası.* // Tənəkədən düzəldilmiş. *Tənəkə vedrə. Tənəkə suqabı.*

**TƏNƏKƏÇİ** *is.* Tənəkədən müxtəlif şeylər qayıran usta, dəmirçi.

**TƏNƏKLİK** *is.* Çoxlu tənək əkilmiş yer; üzümlük, meynəlik. *Tənəkliyi becərmək.*

**TƏNƏLİ** *sif.* Tənə ilə deyilən, tənə ilə dolu; məzəmmətli. *Tənəli sözdənsə, iti qılınc.* (Ata. sözü). [Musa] iş *yoldaşlarının tənəli baxışlarını gördükdən sonra daha səy etmədi.* S.Vəliyev.

**TƏNƏZZÖH** *is.* [*ər.*] Ekskursiya, səyahət.

**TƏNƏZZÜL** *is.* [*ər.*] 1. Enmə, aşağı düşmə; geriləmə, dala getmə, geri getmə, inkişafdan qalma (*tərəqqi* ziddi). *İnkişaf və tənəzzül. Kapitalizmin tənəzzülü.* □ **Tənəzzül etmək** – enmək, aşağı düşmək, geriləmək, geri getmək, dala getmək. *Hacı Nəsirin ticarət işləri tənəzzül etməyə, yavaş-yavaş var-yoxu əlindən çıxmağa başladı.* S.S.Axundov. *Şərq aləmi get-gedə tənəzzül edirdi.* S.Hüseyn.

2. *məc.* Düşkünlük, rəzalət, özünü alçaltma, heysiyyətini itirmə. *Cuma bu vaxta qədər belə bir şərəfsizliyə, tənəzzülə dözdüyünə indi təəccüb etməyə başlayırdı.* Ə.Əbülhəsən.

◊ **Tənəzzül etmək** – özünə eyib, ar bilməmək, özü üçün alçaqlıq hesab etməmək, iltifat göstərmək. *Xəspuşlardan birisi: – Xoş gördük, Varis bəy! Sən də tənəzzül edib bizim şəhərimizə gəlmisən?* A.Şaiq. *Adil və Aqil də bilirdi ki, Mirzə Valeh tənəzzül edib gəlməyəcəkdir.* S.Rəhimov.

**TƏNG** *sif.* [*fars.*] Dar, sıx. *..Məlum edirəm ki, yazdığınız namələr öz vaxtında gəlib yetişibdi. Cavab yazmamağıma bais vaxtın təng olmağıdı.* "Mol. Nəsr." [Cəfər kişi:] *Srağagün vaqon doldururduq, yük çox idi, taylar ağır, vaxt təng.* M.İbrahimov.

◊ **Təngə gəlmək** – bezmək, bezikmək, usanmaq, cana gəlmək, bıqmaq, bezar olmaq. [İmran:] *..Məni çox incidir ki, təngə gəlib gedəm.* S.S.Axundov. [Bədəl:] *Camaat xanların zülmlərindən təngə gəlib.* Ə.Haqverdiyev. **Təngə gətirmək** – bezikdirmək, usandırmaq, cana gətirmək, bıqdırmaq, zəhləsini aparmaq, bezar etmək. [Hacı Murad:] *Daha məni təngə gətirmisən.* S.S.Axundov. [Dilənçilər] *bəzi adamları təngə gətirib bezikdirmək və zəhlələrini aparmaqla da pul alırdılar.* Ə.Sadıq.

**TƏNGİMƏ** "Təngimək"dən *f.is.*

**TƏNGİMƏK** b a x **təngləşmək** 2-ci mənada. *Od tökür, od tökür günəş ağzından; Torpağın nəfəsi təngiyir hərdən.* S.Vurğun.

**TƏNGİŞDİRMƏ** "Təngişdirmək"dən *f.is.*

**TƏNGİŞDİRMƏK** *icb.* 1. Sıxmaq (paltar haqqında).

2. Əsəbiləşdirmək, ürəyini sıxmaq, darıxdırmaq. [Əhməd:] [Cəmilə] *öz-özünü də daha yorub üzməz və təngişdirməz.* S.Rəhimov.

**TƏNGİŞMƏ** "Təngişmək"dən *f.is. Mirzə özü də bu darıxmaqlığın, bu təngişmənin səbəbini bilmir, açıq-aydın edə bilmirdi.* S.Rəhimov.

**TƏNGİŞMƏK** *f.* Təng olmaq, çətinliklə nəfəs almaq, tövşümək, ürəyi sıxılmaq. [Gövhər xanım:] *Oturub bir az özümü havaya verim, nəfəsim təngişir.* S.S.Axundov. *Ər-arvad içəridə çəkişdi, axırda Şəbistan təngişib bayıra çıxdı.* S.Rəhimov.

**TƏNGİTMƏ** "Təngitmək"dən *f.is.*

**TƏNGİTMƏK** b a x **təngləşdirmək** 2-ci mənada. *Asfaltın boğuq istisi adamın nəfəsini təngidirdi.* M.Hüseyn.

**TƏNGLƏŞMƏ** "Təngləşmək"dən *f.is.*

**TƏNGLƏŞMƏK** *f.* 1. Təngə gəlmək, cana gəlmək, bezmək. *Katib təngləşib çıxardı, baş qoşmazdı.* Mir Cəlal.

2. Təng olmaq, sıxılmaq, nəfəsi çətinləşmək, ürəyi sıxılmaq, təngimək. *Bir axşam ürəyim yenə təngləşdi.* T.Ş.Simurq. *Süsən yenə dinmədi. Onun nəfəsi təngləşdi.* M.Hüseyn.

**TƏNGLİK** *is.* Təngnəfəslik, çətin nəfəs alma, hava çatışmazlığı. [Cuma] *köksündə nə isə bir tənglik, bundan başqa, boğazında da bir quruluq hiss edirdi.* Ə.Əbülhəsən.

**TƏNGNƏFƏS** *zərf* [*fars.* təng və *ər.* nəfəs] Nəfəsi kəsilə-kəsilə, nəfəsi tutula-tutula; tez, cəld. [Şair] *dəli kimi irəli atıldı, təngnəfəs özünü içəri saldı.* Ə.Məmmədxanlı. – *Yoldaş Cəlalov! Yoldaş Cəlalov! – deyə, Nailə təngnəfəs halda özünü yetirdi.* H.Seyidbəyli.

**TƏNGNƏFƏSLİK** *is.* Nəfəs təngliyi, çətinliklə nəfəs alma, boğulma, nəfəsi çatmama, hava çatışmazlığı. *Hidayətə gözləmədiyi halda, birdən-birə təngnəfəslik gəldi.* B.Bayramov. // Astma, sinəgirlik xəstəliyi.

**TƏNHA** *sif.* və *zərf* [*fars.*] 1. Tək, yalnız, yalqız. *Səhraya düşüb günəş misali; Tənha yürür oldu laübali.* Füzuli.

2. Kimsəsiz, adamsız. *Bu anda qarşıdakı tindən bir neçə qaraltı çıxaraq, tənha küçə ilə mənə tərəf irəliləməyə başladı.* Ə.Məmmədxanlı. *Burda bir dalğalardı; Bir də tənha qayalar.* Ə.Cəmil.

**TƏNHALIQ** *is.* 1. Təklik, yalnızlıq, yalqızlıq, kimsəsizlik. *Könlümü tənhalıq eylərdi pərişan sinədə; Olmasaydı cəm hər yanımda peykanın görüb.* Füzuli.

2. Boş yer, kimsəsiz yer, adam olmayan yer; issızlıq. [Qasım:] *Mən bu tənhalıqda çox qüssələndim.* S.Vəliyev.

**TƏNQİD** *is.* [*ər.*] 1. Yaxşı cəhətlərini üzə çıxarmaq, nöqsanlarını göstərmək və düzəltmək məqsədilə müzakirə, təhlil. *Tənqid və özünütənqidi inkişaf etdirmək.* – [Hikmət Kamal:] *Biz görürük ki, yoldaş Əmrulla bolşevik tənqidindən qorxur və metodoloji cəhətcə yabançı olan bir əsəri keçirmək istəyir.* C.Cabbarlı. // *dan.* Bir şey haqqında mənfi fikir, rəy. *Hər şeyi tənqid etmək.*

2. Bir şeyin düzlüyünün, səhihliyinin elmi cəhətdən yoxlanması, tədqiq olunması. *Tarixi mənbələrin tənqidi.*

3. Ədəbi-bədii, elmi və s. əsərlərin təhlili ilə məşğul olan xüsusi ədəbi janr. *Ədəbi tənqid. Teatr tənqidi.* // Tənqidi məqalə (yazı). *Əsər haqqında qəzetdə böyük tənqid çıxıb. Tənqidin müəllifi kimdir?*

◊ **Heç bir tənqidə layiq deyil** – cüzi tələblərə cavab verməyən şey haqqında.

**TƏNQİDÇİ** *is.* Tənqidlə məşğul olan adam (b a x **tənqid** 3-cü mənada). *Musiqi tənqidçisi. Tənqidçinin qeydləri. Teatr tənqidçisi. – Pis tənqidçilər tez unudulur, amma yaxşı əsərlər qalır.* M.Hüseyn. // Tənqid edən. *Tənqidçimiz göstərir ki... Tələbkar tənqidçi.*

**TƏNQİDİ** *sif.* [*ər.*] 1. Tənqidə həsr edilmiş, tənqid mahiyyətində olan, tənqid edən (b a x **tənqid** 3-cü mənada). *Tənqidi əsər. – ...Canbalayevin ilk tənqidi məqalələri otuzuncu illərdə çıxmışdı.* İ.Hüseynov. // Zərf mənasında. *Əsəri tənqidi gözdən keçirmək. Bir şeyə tənqidi yanaşmaq.*

2. Tənqid edən, nöqsanları və onların düzəlməsini göstərən. *İclasda tənqidi çıxış. Tənqidi mülahizə.*

◊ **Tənqidi realizm** – incəsənət və ədəbiyyatda burjua-mülkədar quruluşunun həllolunmaz ziddiyyətlərini açıb göstərən bədii cərəyan. *Müəllif "Anamın kitabı"nda da öz tənqidi realizminə sadiq olaraq tipləri, hadisələri, komediyanın süjetini həyatdan, real varlıqdan alır.* M.İbrahimov.

**TƏNQİT** *is.* [*ər.*] *köhn.* b a x **durğu işarələri** ("**durğu**"da).

**TƏNLƏŞDİRİLMƏ** "Tənləşdirilmək"dən *f.is.*

**TƏNLƏŞDİRİLMƏK** b a x **bərabərləşdirilmək**.

**TƏNLƏŞDİRMƏ** "Tənləşdirmək"dən *f.is.*

**TƏNLƏŞDİRMƏK** b a x **bərabərləşdirmək**.

**TƏNLƏŞMƏ** "Tənləşmək"dən *f.is.*

**TƏNLƏŞMƏK** b a x **bərabərləşmək**. *Gecə-gündüz tənləşir; Hava hərdən çənləşir.* A.Səhhət.

**TƏNLİK** *is. riyaz.* Bir və ya bir neçə məchul kəmiyyəti olan və həmin məchul kəmiyyətlərin müəyyən qiymətləri zamanı öz bərabərliyini saxlayan riyazi bərabərlik. *Diferensial tənlik. Birməchullu tənlik.*

**TƏNTƏNƏ** *is.* [*ər.*] 1. Təmtəraq, dəbdəbə, büsat. *Nəsillər! Qulaq asın diqqətlə bir də mənə; Göydəndüşmə deyildir bu calal, bu təntənə.* S.Rüstəm. *..Qızın göz yaşlarına baxmayaraq, zahiri bir təntənə ilə şirnisini içdilər.* M.İbrahimov.

2. Təntənəli məclis, mərasim, ziyafət, bayram. [Əxsitan:] *Özgə təntənədir... Kabab, mey, məzə; Deyirəm, keyf versin qoy Süheyl bizə.* M.Rahim. *Xanlar bu hərəkətilə bayram təntənəsini pozmaq istəyirdi.* Mir Cəlal.

3. *məc.* Qələbə, qalibiyyət. *Səkinənin açıq təntənəsi Rüstəm kişini pərt etmişdi.* M.İbrahimov.

**TƏNTƏNƏLİ** *sif.* və *zərf* 1. Təntənə ilə keçirilən; dəbdəbəli, təmtəraqlı, əzəmətli. *Təntənəli iclas. – Əqd gecəsi çox təntənəli keçmişdi.* S.Hüseyn.

2. Ruh yüksəkliyi ilə, təmtəraqla, təmtəraqlı surətdə. [Sürəyya:] *Tanış olun, bu Mehribandır? – deyə təntənəli surətdə onu təqdim etdi.* H.Seyidbəyli.

**TƏNTİK** *sif. dan.* 1. Sadədil, sadəlövh. *Təntik qoca.*

2. Ağzı söz tutmayan, sözləri aydın deyə bilməyən. [Əlləzoğlu] *tövşüyə-tövşüyə papağı ilə tərini sildi, təntik* (z.) *halda kəkələdi.* İ.Hüseynov.

3.Tələsik, tələsə-tələsə. *Günəş çox təntik bir halda tövşüyə-tövşüyə içəri girdi.* Ə.Vəliyev.

**TƏNTİKLƏMƏ** "Təntikləmək"dən *f.is.*

**TƏNTİKLƏMƏK** b a x **təntimək**.

**TƏNTİKLİK** *is. dan.* 1. Sadədillik, sadəlövhlük.

2. Ağzı söz tutmama, sözləri aydın deyə bilməmə.

**TƏNTİMƏ** "Təntimək"dən *f.is.*

**TƏNTİMƏK** *f. dan.* Tələsmək, darıxmaq, hövsələsini itirmək, tələsməkdən canı sıxılmaq. *Baş çatlayır istidən; Göydən yerə od yağır; Dəvələr də təntiyib; Yeriyir ağır-ağır.* B.Vahabzadə. [Nailə:] *Allah məni öldürsün, qardaş, lap acından təntidin, – deyə mənim qarşımda öz kasıb süfrəsini nizama salırdı.* İ.Hüseynov.

**TƏNTİTMƏ** "Təntitmək"dən *f.is.*

**TƏNTİTMƏK** *f.* Tələsdirərək çaşdırmaq, sıxma-boğmaya salmaq. *Abdulla* [quldurları] *təntitdi.* Ə.Vəliyev. [Gülsənəm:] *Gör bir uşağı nə təntidiblər!* M.Hüseyn. *Əhməd indicə atı ilə bərabər Qadirin qayadan yuvarlanacağını dəhşətlə gözləyir, onu təntitmək üçün atını sürüb qaya cığırına salmayır*(*dı*).. Ə.Əbülhəsən.

**TƏNUMƏND** *sif.* [*fars.*] Boylu-buxunlu, qədd-qamətli. *Ucaboylu, tənumənd qadın irəli yeriyib, oğlunun üzündən öpdü.* Ə.Haqverdiyev. *İki tənumənd kişi qarşı-qarşıya dayanmışdı.* B.Bayramov.

**TƏNZİF** *is.* [*ər.*] Əsasən sarğı materialı kimi işlədilən seyrək toxunmuş nazik pambıq parça; cuna. [Gülyaz] *tələsik çəkməsini*

*çıxarıb tənziflə ayağının yarasını sarıdı*. Q.İlkin. [Səməndər:] *Yaralanan yerə yod vurub, tənziflə bağlamaq lazımdır*. B.Bayramov.

**TƏNZİM** *is.* [*ər.*] Nizama salma (salınma), qaydaya salma (salınma), nizamla(n)ma. ☐ **Tənzim etmək** – nizama salmaq, qaydaya salmaq. [Musa dayı] *..novdan tökülən suyu tənzim etmək üçün yenə də mexaniki bir şey qayırmışdır*. İ.Əfəndiyev.

**TƏNZİMÇİ** b a x **tənzimedici, tənzimləyici**. *Tənzimçi orqan.*

**TƏNZİMEDİCİ, TƏNZİMLƏYİCİ** *is.* və *sif.* Bir prosesi və ya onun ayrı-ayrı anlarını nizama salan, tənzim edən qurğu, mexanizm, cihaz, alət və s. tənzimçi. *Tənzimedici* (*tənzimləyici*) *qayka.*

**TƏNZİMLƏMƏ** "Tənzimləmək"dən *f.is.*

**TƏNZİMLƏMƏK** *f.* Tənzim etmək, nizama salmaq, qaydaya salmaq.

**TƏPCƏK** *is.* 1. Təpilmiş və ya yumşaq torpağı bellə döyəcləyib bərkitmə. ☐ **Təpcək vurmaq** – torpağı bellə döyəcləyib bərkitmək. *Arx qazanda* [Gülşən] *kimi təpcək vuran olmazdı*. Ə.Vəliyev.

2. Tüfəngin döşə dirənən (təpən) hissəsi; dibçək.

**TƏPÇEVİR** *sif.* və *zərf k.t.* Torpağı başaşağı çevirməkdən ibarət təpmə üsulu. *Təpçevir təpmək*.

**TƏPÇİMƏ** "Təpçimək"dən *f.is.*

**TƏPÇİMƏK** *f.* Parçanı üz-üzə qoyaraq qırağını tikmək, qırağını közəmək. [Qadın paltarları] *bir-bir götürərək tələsmədən düyməsi qırılanın düyməsini tikir, cırıq olanına yamaq salır, təpçiyir və bu biri tərəfə qoyurdu.* M.İbrahimov.

**TƏPDİRMƏ¹** "Təpdirmək¹"dən *f.is.*

**TƏPDİRMƏ²** "Təpdirmək²"dən *f.is.*

**TƏPDİRMƏK¹** b a x **bellətmək**. *Bağı təpdirmək*.

**TƏPDİRMƏK²** "Təpmək¹"dən *icb. Cəfər paşa da hər gün onu yeddi pəhləvana döydürüb, sonra da dərisindən bir qarış soydurub yerinə saman təpdirirdi*. "Koroğlu".

**TƏPƏ** *is.* 1. Hündür yer, hündürlük; kiçicik dağ. *Səpir qarı ağaclara, kollara; Dərələrə, təpələrə, yollara.* A.Səhhət. *Camaatın yarısı çıxmışdı kəndin kənarına və təpələrə dırmaşıb boyluyurdular ki, görsünlər gəlirmi naçalnik.* C.Məmmədquluzadə.

2. Bir şeyin ən yuxarı hissəsi, başı, zirvəsi. *Dağın təpəsi. Yamacın təpəsi. Qüllənin təpəsinə çıxmaq. – Qocaman bir dağın təpəsinə dırmaşdıq.* A.Şaiq. [Kamal] *saatlarla gözünü qarlı dağların təpəsinə zilləyib onları seyr etməkdən doymazdı.* M.Rzaquluzadə.

3. Qalaq, taya. *Ot təpəsi. Saman təpəsi.*

4. İnsan və heyvan başının ən üst hissəsi; kəllə, baş. *Qoyunun təpəsinə damğa vurmaq*. – [Məmur:] *Qılıncı xainin təpəsinə çal*. M.Rahim. // Papağın üst tərəfi, üstü. *Papağın təpəsi məxmərdəndir*. – [Hüseynəli əmi] *əlini aparıb börkünün təpəsindən bir parça qov çıxardı*. M.S.Ordubadi.

◊ **Təpədən-dırnağa qədər** – başdan-ayağa (qədər). [Sara xanım] *hamamdan qayıdanda da təpədən-dırnağa qədər qara çarşaba bürünərdi*. Qantəmir. *İyirmi beş yaşlı bu cavan oğlan; Təpədən-dırnağa nəğməydi ancaq.* B.Vahabzadə. **Təpədən-dırnağa qədər süzmək** – b a x **başdan-ayağa süzmək** ("**başdan-ayağa**"da). *İskəndər Quliyev döyüşçünü bir də təpədən-dırnağa qədər süzdü*. Ə.Vəliyev. **Təpəsi üstə** – başaşağı, kəlləmayallaq. [Əhməd:] *Bir badalaq lazımdır, özü də çox balaca, təpəsi üstə dəysin yerə, beyni burnundan gəlsin...* N.Vəzirov. **Təpəsi üstə gəlmək** – 1) başaşağı gəlmək, kəlləmayallaq yıxılmaq. *Uşaq məhəccərə dırmaşanda təpəsi üstə yerə gəlib*. Mir Cəlal; 2) *məc.* tez və həvəslə gəlmək, o saat gəlmək. [Yədulla xan:] *Naməni elə yazmışam ki, Mirzə Valeh təpəsi üstə gələr*. S.Rəhimov. *Telli xalaya xəbər gedən kimi təpəsi üstə gəldi.* Mir Cəlal.

**TƏPƏCİK** *is.* Kiçik təpə, balaca təpə. *..Afaq çoxdan bu yerləri tərk etmiş quşları da geri qaytarmaq istəyərək bağçadakı təpəciyə ..bir çanaq arpa səpələdi*. Ə.Məmmədxanlı.

**TƏPƏL** b a x **qaşqa** 1-ci mənada. *Təpəl balaq dingildəyib həyətdən çıxdı, özünü camışın altına atdı*. B.Bayramov. *Gün altında tövşüyür; Qara kəl, təpəl öküz*. H.Hüseynzadə.

**TƏPƏLƏMƏ¹** *sif.* və *zərf* Qabı, səbəti və s.-ni kənarlarından artıq doldurma; dopdolu, ağzınacan dolu, ləbələb. [Yusif] *kolun altın-*

*da gizlənmiş tənəyin üzümündən dərib, səbəti təpələmə doldururdu*. B.Bayramov.

**TƏPƏLƏMƏ²** "Təpələmək"dən *f.is.*

**TƏPƏLƏMƏK** *f.* 1. Təpə kimi yığmaq, təpə əmələ gətirmək; qalaqlamaq. *Torpağı təpələmək.*

2. Başına qapaz vurmaq.

**TƏPƏLƏNMƏ** "Təpələnmək"dən *f.is.*

**TƏPƏLƏNMƏK** *f.* Təpə kimi yığılmaq, təpə əmələ gəlmək; qalaqlanmaq. *Maşından boşalan qum təpələndi. – Şəkər süfrənin üstündə girdə məcməyi dolusu qalxıb təpələndi*. B.Bayramov.

**TƏPƏLİ** *sif.* Təpəsi, təpələri olan; sivri. *Təpəli dağ. Təpəli yer.*

**TƏPƏLİK** *is.* 1. Təpə olan yer, təpə yer, dərəli-təpəli yer. [Yaşlı kişi:] *Oğlanlı-qızlı bir araya toplaşar, Şərəf xalagilin ağ və təmiz qumdan ibarət olan təpəliyində oynardıq.* S.Hüseyn. – *Onlar qaçacaq! – Tutaq təpəliyi düşməndən qabaq!* S.Vurğun.

2. Kişi, ya qadın papağının təpəsinə dəyirmi kəsilib tikilən parça və s. *Məxmər təpəlik.*

**TƏPƏR** *is.* Qeyrət, namus, bacarıq. *Adın varmış, təpərin yox*. (Ata. sözü).

**TƏPƏRLİ** *sif.* Qeyrətli, namuslu, bacarıqlı. [Salman] *zəif və qorxaqlara özünü təpərli* (z.), *tələbkar, amansız göstərirdi*. M.İbrahimov.

**TƏPİK** *is.* Ayaqla vurulan zərbə. *Telli bütün acığını* [pişikdən] *çıxarmaq istəyirdi. Ayağilə ona bir təpik ilişdirdi.* S.Hüseyn. // Şıllaq. ☐ **Təpik atmaq** – ayağı ilə vurmaq, vurmaq üçün ayağını, ya ayaqlarını işə salmaq (at və s. heyvanlar haqqında). [Nabat:] *..Gülsüm bacı, hərdənbir o düyəyə də baxarsan, Allah vurmuş dəlidir, təpik atıb südü dağıdar, arvadı vurar, yıxar.* C.Cabbarlı. **Təpiyə qalxmaq** – hər iki ayağı ilə təpik vurmaq, təpikləmək, təpik atmaq. [Gülo:] *Yaman dəymişi gözlə, yoxsa bu da vəlləyib dərzi dağıdacaq, – dedi və özünü təpiyə qalxan ala cöngəyə tərəf tulladı*. S.Rəhimov.

◊ **Təpik-təpiyə vermək (gəlmək)** – təpikləşmək, yola getməmək. [Qurban Telliyə:] *Zarafat deyil, o böyük alim Mudrova zidd gedirik. Akademiklə təpik-təpiyə vermişik!* Ə.Məmmədxanlı.

**TƏPİKATAN** b a x **təpikcil**.

**TƏPİKCİL** *sif.* Çox təpik atan, şıllaq atan (heyvan haqqında). *Təpikcil at.*

**TƏPİKLƏMƏ** "Təpikləmək"dən *f.is.*

**TƏPİKLƏMƏK** *f.* 1. Təpiyi ilə vurmaq, təpik vurmaq, ayaqları ilə zərbə endirmək. [Bayraməli bəy:] *..Yoxsa istəyirsən yıxım, qarnını təpikləyim?* N.Vəzirov. *Zalış* [Məşədi Qasıma] *bir badalaq atıb yıxdı və Qənbəri də çağırıb bunu təpikləməyə başladılar.* Çəmənzəminli.

2. Getməsi və ya sürətini artırması üçün ayaqları ilə minik heyvanının yanlarını döyəcləmək. *Kərbəlayı Qasım atı çəkdi yavığa və Qurbanəli bəy tez qalxdı atın üstünə və heyvanı təpiklədi*. C.Məmmədquluzadə. *Şirəli qara madyanı təpiklədi.* M.Hüseyn.

**TƏPİKLƏNMƏ** "Təpiklənmək"dən *f.is.*

**TƏPİKLƏNMƏK** *məch.* Təpiklə vurulmaq, təpiklər altında qalmaq, ayaqlanmaq. *Müharibə meydanında mərmər başlar əzilməkdə idi, qarınlar təpiklənməkdən ayran tuluğuna dönmüşdü.* Çəmənzəminli.

**TƏPİKLƏŞMƏ** "Təpikləşmək"dən *f.is.*

**TƏPİKLƏŞMƏK** *qarş.* Bir-birini təpiklə vurmaq, təpikləmək. *Dayçalar təpikləşir*. – [Uşaqların] *bəziləri təpikləşir, bəziləri qoşa durub yüyürür, bəziləri isə ..yoldaşlarından geri qalırdılar.* M.Hüseyn.

**TƏPİLMƏ¹** "Təpilmək¹"dən *f.is.*

**TƏPİLMƏ²** "Təpilmək²"dən *f.is.*

**TƏPİLMƏK¹** b a x **bellənmək**. *Meynəlik təpildi.*

**TƏPİLMƏK²** 1. *f.* Soxulmaq, zorla girmək, dürtülmək, özünü soxmaq. *Uşaq anasının qucağına təpildi*. – [Sara] *vaxsey, ciyərin yansın! Kişi bilər, – deyə, evə təpildi.* Mir Cəlal. [Arvad] *üstünə işıq düşən toyuq hininə təpildi.* B.Bayramov.

2. *məch.* Çətinliklə torbaya, yeşiyə və s.-yə qoyulmaq, basılmaq, dürtülmək, doldurulmaq. *Təpilir bir yanda tumac xurcuna; Qənaət etmirlər qaçaqlar buna.* H.K.Sanılı.

**TƏPİMƏ** "Təpimək"dən *f.is.*

**TƏPİMƏK** *f. dan.* Qurumaq, qupquru olmaq, suyu çəkilmək. *Gülpərinin özü də susuz idi. Dili-dodağı təpimişdi.* M.Hüseyn. *Gecə külək əsdiyi üçün yol təpimiş sahə qurumuşdu*. Ə.Vəliyev.

**TƏPİNMƏ** "Təpinmək"dən *f.is.*

**TƏPİNMƏK** *f.* 1. Acıqlanmaq, bərk danlamaq, üstünə qışqırmaq; hədə-qorxu gəlmək. [Balaqardaş:] *Rzaquluya elə təpinmişəm ki, qorxusundan evdən çölə çıxa bilməyir.* N.Vəzirov. *Qardaş da bacısına təpinmək üçün onu yanladı.* B.Bayramov.

2. Üstünə cummaq, hücum etmək, həmlə etmək, şığımaq. *Nəbigil atlarını minib təpindilər qoşuna.* "Qaçaq Nəbi". *Nərə çəkib təpinəndə soldata; Sel kimi axıdır qanı Dəli Alı.* Aşıq Ələsgər.

**TƏPİŞDİRMƏ** "Təpişdirmək"dən *f.is.*

**TƏPİŞDİRMƏK** *f.* 1. Təpib doldurmaq, basıb doldurmaq.

2. *məc.* Acgözlüklə yemək, içəri ötürmək. *Varis qarşısındakı soyuq şorbanı təpişdirərkən qızı gözucu süzdü.* A.Şaiq.

**TƏPİTMƏ**[1] *is.* 1. Xalq təbabətində: bədənin sınıq, çıxıq, əzik yerinə qoyulan yağlı isti xəmir parçası. *Sınıq yerə təpitmə qoymaq.* – [Mustafa bəy:] *Get, gədələrə deginən, bədəninə təpitmədən-zaddan salsınlar.* Ə.Haqverdiyev.

2. Xingal bişirmək üçün yayılıb doğranmış və azacıq qurudulmuş xəmir tikələri. *Yuxası nazik yayılmış, təpitməsi yaxşı hazırlanmış xingal sinidə buğlana-buğlana ortaya gəldi.* Ə.Vəliyev.

**TƏPİTMƏ**[2] "Təpitmək"dən *f.is.*

**TƏPİTMƏK** *f.* Od üzərində və ya gündə azacıq qurutmaq. *Xəmiri təpitmək.* // Ümumiyyətlə, qurutmaq.

**TƏPMƏ**[1] b a x **təpitmə**[1] 1-ci mənada. [Cabbar bəy:] *Əndamına təpmə qoymaqdan qollarım az qalıbdır qurusun.* N.Vəzirov.

**TƏPMƏ**[2] *is.* Tüfəng, top və s. odlu silahların atılan zaman şiddətlə geriyə basması. *Topun təpməsi.* – *..Tüfəng açıldı. Özüm də təpmənin şiddətindən kəlləmayallaq qayığın dibinə aşdım.* M.Rzaquluzadə.

**TƏPMƏK**[1] *f.* 1. Bir şeyi başqa bir şeyin içərisində yerləşdirmək; soxmaq, salmaq. [Xırdaxanım:] *Qırqovul başını kola təpər, dalından xəbəri olmaz.* N.Vəzirov. *Səttar xanın bu söhbətdən xoşlanmadığını hiss etdim, çünki daima bu kimi hallarda bığlarını burub, uclarını ağzına təpərdi.* M.S.Ordubadi. // Güclə soxmaq, doldurmaq, yerləşdirmək, basmaq, qoymaq, dürtmək, dürtüşdürmək. *Paltarları çamadana təpmək. Samanı kisəyə təpmək.*

2. Hücum etmək, həmlə etmək, şığımaq, üzərinə atılmaq. [Pası] *gecələr də adamları rahat buraxmır, çobanları oyadıb: – Sərvaxt olun, heyvana canavar təpər* [deyərdi]. S.Rəhimov.

3. Basmaq, təpməklə, təpikləməklə hazırlamaq (keçə). *Şah bu sözlərini qurtaran tək* [keçəçilər] *təsnif oxuya-oxuya keçə təpirlər.* Ü.Hacıbəyov.

4. *dan.* Təpik atmaq, təpikləmək. *Danasını bir gün qoymaz yanına; Bizim inək təki təpər, ağlarsan.* M.V.Vidadi.

5. Atarkən şiddətlə geri itələmək, basmaq, ağzı geri qayıtmaq (odlu silahlar haqqında). *..Tüfəng Yaşarı elə təpdi ki, o, arxası üstə yerə yıxıldı.* M.Rzaquluzadə.

◊ **Başına at təpmək** – b a x **baş**. **Dərisinə saman təpmək** – b a x **dəri**.

**TƏPMƏK**[2] *f.* Belləmək. *Gülşən elə cəld, elə sürətlə yer təpirdi ki, onun üz-gözündən tər axırdı.* Ə.Vəliyev.

**TƏPTƏZƏ** *sif.* Lap təzə, tamamilə təzə, qədtəzə, heç işlənməmiş. *Təptəzə köynək. Təptəzə ev.* – *Təptəzə, püstə rəngində* "*Pobeda*" *maşını asfalt yolla süzürdü.* Ə.Sadıq. *Təptəzə bir paltar geyib əyninə; Qovuşub yurdumun xoş səhərinə.* N.Xəzri.

**TƏR**[1] *is.* 1. Xüsusi dərialtı vəzilərin ifraz etdiyi şəffaf maye. *Maşında oturanların alnından tər süzülürdü.* M.İbrahimov. *Arvad kişinin alnının dərin qırışlarına dolmuş soyuq təri sildi.* B.Bayramov. ☐ **Tər aparmaq (basmaq)** – çox işləməkdən və ya istidən çox tərləmək. *Bir anda Nisa xalanı tər apardı.* Mir Cəlal. **Tər vəzisi** *anat.* – tər ifraz edən dərialtı vəzi.

2. Daha yüksək temperaturu olan hava mühiti ilə təmas etdikdə əşyaların üzərində əmələ gələn yaşlıq.

◊ **Tər tökmək** *məc.* – 1) bir şeyi əldə etmək üçün çox çalışmaq, çapalamaq, çox əlləşmək, çox zəhmət çəkmək; 2) *məc.* xəcalət çəkmək, utanmaq. *Ona fikir verin, danışdıqca biz; Tər tökür, sıxılır, utanır hər an.* B.Vahabzadə. **Alın təri** – b a x **alın**. **Alın təri ilə qazanmaq** – b a x **alın**. **Alın təri tökmək** – b a x **alın**.

**TƏR**[2] *sif.* və *zərf* Hələ solmamış, təzə, təravətli (gül, göyərti və s. haqqında). *Tər göy soğan. Tər bənövşə. Tər xiyar. – Aylı gecə, çay kənarı, suların səsi; Ürəyimin məhəbbəti tər çiçəyimdir.* N.Xəzri. // *məc.* Cavan, təravətli. *Hər bir şeyə həyat verən, hər bir şeyi tər və təzə qılan məhəbbətdir*! F.Köçərli. [Nisə xalanın] *yaşı əllidən keçdiyi halda, necə olub da onun belə diri və tər qaldığına ilk görüşdə təəccüb edirdim.* Qantəmir.

**TƏRANƏ** *is.* [*fars.*] Mahnı, şərqi, nəğmə; ahəng. *Yayılıbdır ətrafa; Quşların təranəsi*. M.Seyidzadə. // Obrazlı təşbehlərdə. *Burdadır şairin eşqi, ilhamı; Bu günün, sabahın öz təranəsi*. H.Hüseynzadə.

**TƏRAVƏT** *is.* [*ər.*] Təzəlik, lətafət, gözəllik. *Çiçəklərin artdı təravətləri; Fərəh verir qəlbə lətafətləri*. A.Səhhət. *Bahar bütün təravəti və gözəlliyi ilə* [Ümidin] *gözləri qarşısında dayandı*. B.Bayramov.

2. Təmizlik, saflıq. *Saf, səmimi, heç vaxt öz təravətini itirməyən, solmayan eşq nə gözəldir!* Ə.Sadıq.

3. Sərinlik, təmizlik (hava haqqında). *Bundan əlavə, ağaclardan .. təravət yayılırdı*. H.Seyidbəyli.

4. Sağlamlıq, sağlam görünüş (əsasən gənc yaşlarda). *Gənclik təravəti. – Əsmərin gəncliyi, təravəti Məmmədbağıra oğlan uşağı qədər lazım idi.* S.Hüseyn. *Ana oğlunun təravət və gəncliyini bütün vücudu ilə duyurdu.* İ.Əfəndiyev.

◊ **Təravət vermək** – 1) gözəlləşdirmək, lətafət vermək. *Yaz yağışı təbiətə təravət verir. – Yayın günəşi, qışın şaxtası qızın yanaqlarına xoş bir qırmızılıq və təravət vermişdi*. M.Rzaquluzadə; 2) rövnəq vermək, rövnəqləndirmək. [Xanım] *rəngsiz dodaqlarını dili ilə isladıb, əsgimiş üzünə təravət vermək istədi*. Çəmənzəminli. **Təravətdən düşmək** – 1) təzəliyini, gözəlliyini, tərliyini, lətafətini itirmək; solmaq, solğunlaşmaq. *Çöllərdəki yaşıl əkinlər lazımınca boy atmadan təravətdən düşürdü*. S.Hüseyn; 2) qocalmaq və ya xəstələnmək nəticəsində sağlamlığını, gümrahlığını, sağlam görünüşünü itirmək. *Dilbərim yorulub səyahətindən; Düşübdür o keçən təravətindən.* S.Vurğun.

**TƏRAVƏTLƏNMƏ** "Təravətlənmək"dən *f.is.*

**TƏRAVƏTLƏNMƏK** *f.* 1. Təzələnmək, tərlənmək, lətafətli olmaq. *Sulandıqda güllər təravətlənir. – Aralanır buludlar; Təravətlənir otlar.* A.Səhhət.

2. Sərinləşmək, sərin olmaq. *Hava təravətlənir.*

3. Sağlamlaşmaq, gümrahlaşmaq, canlanmaq. *Dağda adam təravətlənir. – Payız gəlib, meşələri solduranda körpə Bahar daha da təravətlənmişdi.* B.Bayramov.

**TƏRAVƏTLİ** *sif.* və *zərf* 1. Təravəti olan; tər, təzə. *Təravətli gül. – ..Hər tərəfdə otlar göyərmiş, ağacları təravətli yarpaqlar örtmüşdür.* M.İbrahimov.

2. Təmiz, saf, sərin. *Bayırda gözəl, ılıq dağ yerlərinə məxsus yüngül təravətli bir iyun sabahı açılırdı.* M.Rzaquluzadə. *Öz canından əziz tutur; Təravətli yaylaqları*. H.Hüseynzadə.

3. Sağlam, sağlam görünüşlü, gümrah, gözəl, cazibəli. *Təravətli gənc.* – [Şəmsiyyə] *incə, ətirlənmiş və təravətli bir xanımdır*. M.İbrahimov.

**TƏRBİYƏ** *is.* [*ər.*] 1. Təhsil verməklə, hər hansı adət, ədəb və davranış qaydaları və s. aşılamaqla yetişdirib böyütmə. *..Əhməd bir daha evlənməyi özünə artıq bilib, daim* [Rəfiqənin] *tərbiyəsilə özü məşğul olardı.* İ.Musabəyov.

2. İnsanın, ümumi inkişaf, sistematik təsir və təlim nəticəsində biliyə, mədəni vərdişlərə və s.-yə yiyələnməsi; gözəl əxlaq. *Gənclərin tərbiyəsilə yaxından məşğul olmaq lazım gəlirdi*. Ə.Sadıq. *Bəzən cavanların tərbiyəsi ilə də məşğul olmaq lazım gəlir.* H.Seyidbəyli. □ **Tərbiyə vermək (etmək)** – b a x **tərbiyələndirmək**. *Mirzə qazandığı pul ilə dolanıb, oğlanlarına da tərbiyə verirdi.* Ə.Haqverdiyev. *Qəhrəman yaxşı dərk edirdi ki, övlad yetişdirib tərbiyə etmək ağır dağı çiyinə qaldırmaq deməkdir.* S.Rəhimov.

**TƏRBİYƏÇİ** *is.* 1. Uşaq tərbiyə müəssisələrində (körpələr evi, uşaq bağçası, uşaq evi və s.) uşaqların tərbiyəsi ilə məşğul olan adam. *Ağlı söz kəsəndən bəri ana nəvazişini tərbiyəçilərdə görən.. Budaq xalasının söhbətindən sonra uzun müddət ata və ana haqqında*

*düşünürdü.* Ə.Vəliyev. // Sif. mənasında. *Tərbiyəçi qadın. – Tərbiyəçi müəllim* [uşağı] *danladı*. Ə.Sadıq.

2. Öyrədib yetişdirən adam; müəllim. *Azərbaycan aktyorlarının birinci nəslinin tərbiyəçisi gözəl komediya aktyoru Cahangir Zeynalov olmuşdur.* M.Məmmədov.

**TƏRBİYƏLƏNDİRİLMƏ** "Tərbiyələndirilmək"dən *f.is.*

**TƏRBİYƏLƏNDİRİLMƏK** *məch.* Tərbiyə edilmək.

**TƏRBİYƏLƏNDİRMƏ** "Tərbiyələndirmək"dən *f.is.*

**TƏRBİYƏLƏNDİRMƏK** *f.* 1. Tərbiyə vermək, tərbiyə öyrətmək. *Uşağı tərbiyələndirmək.*

2. Sistematik təsir və təlim vasitəsilə birinin və ya bir çoxlarının inkişafına, təfəkkür tərzinə, hisslərinə təsir etmək; böyütmək, yetişdirmək. *Məsuliyyət hissi tərbiyələndirmək. Azadlıq uğrunda mübarizlər tərbiyələndirmək.*

**TƏRBİYƏLƏNMƏ** "Tərbiyələnmək"dən *f.is.*

**TƏRBİYƏLƏNMƏK** *f.* Tərbiyə almaq, tərbiyə öyrənmək. *Uşaq valideynlərindən tərbiyələnir. – Altı il ərzində Budaq oxudu, tərbiyələndi.* Ə.Vəliyev.

**TƏRBİYƏLİ** *sif.* Yaxşı tərbiyə görmüş, özünü aparmağı bacaran; əxlaqlı. *Tərbiyəli oğlan* (*qız*). – *Qoşatxan mədəni və tərbiyəli adam idi*. M.İbrahimov.

**TƏRBİYƏSİZ** *sif.* Yaxşı tərbiyə görməmiş, özünü aparmağı bacarmayan; əxlaqsız, ədəbsiz. *Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama!* M.Ə.Sabir.

**TƏRBİYƏVİ** *sif.* [*ər.*] Tərbiyə üçün edilən, tərbiyə üçün əhəmiyyəti olan, tərbiyəyə aid olan, tərbiyə baxımından. [Qüdrət:] *Tərbiyəvi məqsədlə deyilən bir sözə əsasən istehsalatın taleyini həll etmək nə mənə yaraşır, nə də sizə.* M.Hüseyn. *1928-ci ilin axırlarında tamaşaya qoyulan* "*Sevil*" *pyesinin tərbiyəvi rolu çox böyük idi.* M.Arif.

**TƏRCİBƏND** *is.* [*ər.* tərci və *fars.* bənd] *ədəb.* Mövzu və vəzn etibarilə bir olub, birinci bəndin bütün misraları həmqafiyə, ikinci bəndin son beyti istisna olmaqla bütün misraları, axırda isə birinci bəndin son beyti nəqərat kimi təkrar edilən klassik şeir formalarından biri. *Füzulinin* "*Mən kiməm? – Bir bikəsü biçarəvü bixaniman*" *tərcibəndi.*

**TƏRCİH** *is.* [*ər.*]: **tərcih etmək** – üstün tutmaq, üstünlük vermək. [Ramazan] *buğlanan yağlı bozbaşı mübahisəyə tərcih etdi.* M.Hüseyn.

**TƏRCÜMAN** *is.* [*ər.* "tərcümə"dən] *köhn.* 1. Tərcüməçi. *Həmin məsələlərdən birisi də sabiq alman konsulxanası tərcümanlarından Əbülfət mirzənin evini axtarmaq və bəzi məsələləri aydın etməkdən ibarət idi.* M.S.Ordubadi.

2. *məc.* İfadə edən, bildirən, əks etdirən. [M.F.Axundzadə] *ədəbiyyatı öz duyğularının, öz məfkurələrinin bir tərcümanı kimi tanıyır,* .. "*sənət həyat üçündür*" *prinsipini irəli sürürdü.* C.Cabbarlı.

**TƏRCÜMEYİ-HAL** *is.* [*ər.*] Bir şəxsin həyatının təsviri; həyat tarixçəsi; bioqrafiya. [Budaq] *istəyirdi ki, öz tərcümeyi-halını yazsın.* Ə.Vəliyev. [Fərəc Fəridəyə:] *Mən ancaq onu demək istəyirdim ki, siz* [Şeydanın] *tərcümeyi-halına bələd deyilsiniz*. Ə.Məmmədxanlı. // Birisinin həyatı, həyat yolu. *Veteranın ibrətamiz tərcümeyi-halı. – Əsədin qəribə tərcümeyi-halı vardı.* S.Vəliyev.

**TƏRCÜMƏ** *is.* [*ər.*] Bir dildən başqa dilə çevirmə (çevrilmə). *Sərbəst tərcümə.* "*Şahnamə*"*nin tərcüməsi. – Usta Zeynalın dükanında Mirzə qəzəllər oxuyub, sonra oxuduğu qəzəlləri rus dilinə tərcümə edirdi.* Ə.Haqverdiyev. [Rüstəm bəy Sofiyaya:] [Ömər Xəyyam] *dünyanın hər bir dilinə tərcümə olunmuşdur*. Çəmənzəminli.

**TƏRCÜMƏÇİ** *is.* Bir dildən başqa dilə tərcümə etməklə məşğul olan adam; mütərcim. *Teymur tərcüməçi vasitəsilə alimə müraciət edərək soruşur..* "M.N.lətif."

**TƏRƏ** b a x **pencər**. *Tərə yeyən də yaza çıxar, kərə yeyən də.* (Ata. sözü).

**TƏRƏCƏ** *is.* Üstünə barama qurdu buraxmaq və ya üstündə pambıq, meyvə və s. qurutmaq üçün qamış, qarğı və s.-dən hörgü. *Baramanı tərəcəyə buraxmaq. – Bütün manqalarda pambığı havada qurutmaqdan ötrü hər yığıcı üçün qamışdan bir səyyar tərəcə hazırlanmışdır.* Ə.Vəliyev.

**TƏRƏÇİÇƏKLİLƏR** *cəm bot.* Bəzi ot, yarımkol və kolların daxil olduğu bitki fəsiləsi.

**TƏRƏDDÜD** *is.* [*ər.*] 1. Bir işi görməkdə, bir məsələni həll etməkdə qətiyyət göstərməmə, qərarsızlıq göstərmə, nə edəcəyini bilməmə, qəti qərara gələ bilməmə; qərarsızlıq. [Əli] *daima axtarış yolunda, tərəddüd içində yaşayırdı*. Çəmənzəminli. *Təliə də tərəddüdlər içərisində olduğuna baxmayaraq, vəliəhdə göz qoyurdu.* M.S.Ordubadi. □ **Tərəddüd etmək (göstərmək)** – qəti qərara gələ bilməmək, çətinlik çəkmək.

2. Gediş-gəliş, əlaqə, hərəkət. *Yollarda tərəddüd getdikcə çoxalmışdır*. □ **Tərəddüd eləmək** *köhn.* – gedib-gəlmək, hərəkət etmək. *Küçələri arşından qalın qar elə tutmuşdu ki, tərəddüd eləmək mümkün deyil idi.* C.Məmmədquluzadə. **Tərəddüd kəsilmək** – gediş-gəliş kəsilmək, əlaqə kəsilmək, hərəkət olmamaq. *Yollar bağlandı, tərəddüdlər kəsildi*. C.Məmmədquluzadə. *İlin səkkiz ayını Zəngəzur yollarını qar basar, tərəddüdlər kəsilər*. Ə.Haqverdiyev.

**TƏRƏDDÜDLÜ** *sif.* 1. Tərəddüd keçirən, nə edəcəyini qəti bilməyən, bir qərara gələ bilməyən, tərəddüd içərisində qalmış. *Tərəddüdlü adam*. // Tərəddüdlə edilən, qəti olmayan. *Tərəddüdlü cavab*.

2. Çox gediş-gəliş olan: hərəkətli. *Hərçənd Danabaş kəndi tərəddüdlü deyil, amma çox yekə kənddi*. C.Məmmədquluzadə.

**TƏRƏDDÜDSÜZ** *zərf* Tərəddüd etmədən, qəti olaraq. *Bəli, Bağdad! – deyə, Zahidoğlu tərəddüdsüz cavab verdi.* S.Rəhimov.

**TƏRƏDDÜM** *is.* [*ər.*] *köhn.* İrəlidə olma, ötmə.

**TƏRƏF** *is.* [*ər.*] 1. Bir şeydən hər hansı istiqamətə doğru yerləşən sahə, yer; həmin istiqamətin özü; cəhət. *Müxtəlif tərəflərə getmək. Çöl tərəfdən. Meşə tərəfə. Evə tərəf.* // Bir şeyin ortasından və ya orta xəttindən sağda və ya solda yerləşən sahə, yer; habelə bir adamdan və ya şeydən sağa və ya sola doğru olan istiqamət; cəhət. *Sağ tərəfə dönmək. – Məmmədhəsən əminin sol tərəfində oturan kişi bir məsələ saldı ortalığa.* C.Məmmədquluzadə. // Bir şeyin kənarlarında yerləşən sahə; kənar. *Küçənin sol tərəfi. Çayın o biri tərəfi. – İki tərəfi ağac, əkin və bostanla bəzənmiş bir yol ilə gedirdik.* A.Şaiq. *Kazarma küçənin o biri tərəfində idi.* M.Hüseyn.

2. Hər hansı bir səbəblə bir-birinə qarşı duran şəxs və ya qruplardan hər biri. *Mübahisə edən tərəflər. Danışıq aparan tərəflər. Tərəflər razılığa gəldilər. – Əgər Ağca tərəf qalib gəlsə idi, demək olar ki, Şükür sakitləşərdi.* Çəmənzəminli. *Tərəflər dalğalandı; Qarşı-qarşıya gəldi*. B.Vahabzadə.

3. Hər hansı bir şeyin üzlərindən hər biri. *Parçanın üz tərəfi. Yeşiyin alt tərəfi*.

4. Yer, ölkə (bu mənada çox vaxt cəm şəklində işlənir). *Bizim tərəflərdə qar yağıb. Bu tərəflərdə az görünürsünüz. – Sən bizim tərəfə xoş buyurmusan; Qardaşım, bir gün də mən sizə gələm*. H.Hüseynzadə.

5. *riyaz.* Həndəsi fiqurun kənarında olan düz xətt kəsiyi. *Düzbucaqlı üçbucağın tərəfləri. Çoxbucaqlının tərəfləri.*

6. B a x **tərəfdar**. [Fatma xala:] *Kasıbın nəyi var ki, ona tərəf olan da ola?* Ə.Əbülhəsən.

7. Aid olduğu sözlə birlikdə hərəkətin hansı istiqamətə yönəldiyini bildirir; ...sarı, ...doğru, ...tərəfə. *Əhli-qəryə yüyürdü dağ tərəfə; Getməsin ta qoyun, quzu tərəfə*. M.Ə.Sabir. *Əsəd vəldən enib kəndə tərəf baxır*. C.Məmmədquluzadə.

◊ **Tərəfində durmaq** – b a x **tərəfini saxlamaq**. *Kimi dindirsəydin Hikmətin tərəfində duracaqdı*. Mir Cəlal. **Tərəfini saxlamaq (tutmaq)** – tərəfdar olmaq, müdafiə etmək, tərəfində durmaq. *Qız ailədə həmişə anasının tərəfini saxlasa da, Ziba atasının tərəfini saxlamış və onun dediklərinə tərəfdar çıxmırdı*. S.Rəhimov. **Dörd (hər) tərəf** – ətraf. [İzzəddin:] *Burda məclis quraq, gözəl çəməndir; Hər tərəf nərgizdir, tər yasəməndir*. M.Rahim. *Hər tərəf sükut içindəydi*. İ.Əfəndiyev.

**TƏRƏFDAR** *is.* [*ər.* tərəf və *fars.* ...dar] Birinin tərəfini saxlayan, tərəfində duran, onu müdafiə edən adam; tərəfgir. *Molla Xəlil açıqdan-açığa görürdü ki, kənddə müəllimin tərəfdarları vardır*. S.Hüseyn. *Çıxmısan meydana, yalqızsan, tərəfdarın hanı?* Ə.Nəzmi. // Hər hansı bir dünyagörüşünə, əqidəyə, məfkurəyə şərik olan, onu müdafiə edən; müdafiəçi. *Sülh tərəfdarları. Demokratiya tərəfdarı*. – [İşçilərdən biri:] *Bizə nə düşübdür ki, Nikolaya tərəfdar olaq*. C.Cabbarlı.

**TƏRƏFDARLIQ** *is.* Tərəfdar olma, tərəfini tutma, tərəfgirlik.

**TƏRƏFGİR** [*ər.* tərəf və *fars.* ...gir] b a x **tərəfdar**.

**TƏRƏFGİRLİK** b a x **tərəfdarlıq**. *Təəssüf ki, bəzən tənqiddə xoşa gəlməyən bir tərəfgirlik, dostbazlıq baş verir ki, baxanda quruyub qalırsan*. S.Rəhimov.

**TƏRƏHHÜM** *is.* [*ər.*] *klas.* Rəhm, mərhəmət. *Olmazmı kəniz cinsi-mərdüm? Yoxdurmu kənizə həm tərəhhüm?* Füzuli. ◻ **Tərəhhüm etmək (eyləmək)** *klas.* – rəhm etmək. [Vəzir:] *Başına dönüm, keçən padşahlar ədalətin icrasında övlad və əqrəbalarına tərəhhüm etməyiblər.* M.F.Axundzadə. *Tərəhhüm eyləmədin axır, ey cavan, ölürəm.* X.Natəvan.

**TƏRƏK** *is.* [*fars.*] Yağda qovrulmuş şəkər və undan hazırlanan halva növü; sucuq. *Ramazan ayının özünə məxsus süfrəsi vardı: firni, tərək, bal halvası, nazik yuxa, şorqoğalı .. və sairə*. H.Sarabski.

**TƏRƏKƏ** *is.* [*ər.*] Mirasın varislər arasında bölümü.

**TƏRƏKƏMƏ** *is.* 1. Keçmişdə: Azərbaycanda köçəri heyvandarlara verilən ad. *Tarverdi başıbağlı, koxa və Məşədi Qurban və Nəcəf, Namaz və başqa tərəkəmələr oturublar.* M.F.Axundzadə. *Məlumdur ki, bir az hava qızdı, tərəkəmə əhli aranda dayana bilməz, gərəkdir yaylağa qaçsın.* F.Köçərli.

2. Azərbaycan xalq oyun havalarından birinin adı. *Tərəkəmə oyun havası ilə ənzəli oyun havasını müqayisə etsək, burada hər iki havanın vəzninin eyni və çalınmaq sürətinin də təxminən bərabər olduğunu görərik.* Ə.Bədəlbəyli.

**TƏRƏQQİ** *is.* [*ər.*] İrəliləmə, irəliləyiş, inkişaf. *Mədəniyyətin tərəqqisi. – Aqronom, baytar, zootexnik, mühəndis, yerölçən yeni kəndin tərəqqisi uğrunda ciddi işə girişdi.* Ə.Vəliyev. ◻ **Tərəqqi etmək** – irəliləmək; inkişaf etmək. [Oqtay:] *Tərəqqi etməmək yaşamamaq deməkdir*. C.Cabbarlı. **Tərəqqi tapmaq** – b a x **tərəqqi etmək**. *Şəhərdə hər bir şey tərəqqi tapmışdı, dəyişmişdi, abad olmuşdu*. Çəmənzəminli.

**TƏRƏQQİPƏRVƏR** *sif.* [*ər.* tərəqqi və *fars.* ...pərvər] İctimai tərəqqiyə çalışan, ona xidmət və yardım edən; ictimai-iqtisadi cəhətdən qabaqcıl. *Tərəqqipərvər adam. Tərəqqipərvər qüvvələr. – Ağəli tərəqqipərvər iranlıların ən qeyrətli, ən məsləkli cavanlarından idi*. Çəmənzəminli.

**TƏRƏNNÜM** *is.* [*ər.*] Gözəl səslə yavaşdan oxuma, ötmə. *Quşların şən tərənnümü.* ◻ **Tərənnüm etmək** – 1) gözəl səslə yavaşdan oxumaq. *Quşlar tərənnüm edir;* 2) nəğmələrdə, mahnılarda, şeirdə təsvir etmək, şöhrətləndirmək. *Əmək igidliklərini nəğmələrdə tərənnüm etmək. – Xalq* [Səfəri] *..igid, mərd, ədalətli bir adam kimi tərənnüm edirdi.* Çəmənzəminli. *El aşıqları incə Azərbaycan dilində xalqımızın mərdliklərini tərənnüm edən ölməz dastanlar qoşurdular*. İ.Əfəndiyev.

**TƏRƏSSÜD** *is.* [*ər.*] 1. Diqqətli baxış, göz dikmə.

2. Arzu etmə.

**TƏRƏVƏZ** *is.* Yemək və xörək üçün işlədilən bostan bitkiləri (xiyar, kök, çuğundur, pomidor, badımcan və s.).

**TƏRƏVƏZÇİ** *is.* Tərəvəz əkib becərməklə məşğul olan adam. *Tərəvəzçilər briqadası.*

**TƏRƏVƏZÇİLİK** *is.* Kənd təsərrüfatının tərəvəz əkib-becərməklə məşğul olan sahəsi. *Tərəvəzçilik sovxozu. Tərəvəzçilik gəlirli sahədir*. // Tərəvəz əkib-becərmə, tərəvəzçiliklə məşğul olma.

**TƏRƏVƏZLİK** *is.* Tərəvəz əkilmiş yer, tərəvəz tarlası, dirrik. *Əsəd həyətdəki tərəvəzlikdə qurdalanırdı*. S.Rəhman.

**TƏRƏZİ** *is.* [*fars.* tərazu] Ağırlığı çəkib müəyyənləşdirmək üçün cihaz. *Tərəzi başında duran kolxozçu tez-tez pambıq kisələrini çəkir, rəqəmləri ucadan deyir, briqada başçısı da dəftərçəsinə qeyd edirdi*. T.Ş.Simurq. ◊ **Tərəziyə vurmaq** – çəkmək. **Tərəziyə girmək** – özünü tay tutmaq, ayaqlaşmaq. [Həsən ağa:] *Sənə varlılarla tərəziyə girmək nə yaraşar, yorğanına bax, ayaqlarını uzat.* Ə.Haqverdiyev.

**TƏRƏZİÇİ** *is.* Şeyləri tərəzidə çəkən və ya onların çəkilməsinə nəzarət edən işçi. // Qapançı.

**TƏRƏZİPULU** *is.* Şeyləri tərəzidə çəkmək üçün alınan rüsum.

**TƏRGİTDİRMƏ** "Tərgitdirmək"dən *f.is.*

**TƏRGİTDİRMƏK** *icb.* Tərgitməyə məcbur etmək.

**TƏRGİTMƏ** "Tərgitmək"dən *f.is.*

**TƏRGİTMƏK** *f.* Adət etdiyi pis və ya zərərli adətdən əl çəkmək, həmin işi daha etməmək. *İçkini tərgitmək. Papirosu tərgitmək. – Əsil məsələ* [tənbəllərə, şöhrətpərəstlərə, aravuruşduranlara] *bu xasiyyətləri tərgitməkdir.* Ə.Sadıq. *Nə çıxar fikirdən, boş-boş xəyaldan; Tərgitmək gərəkdir bu pis vərdişi!* B.Vahabzadə.

**TƏRHALVA** *is.* Yağda qovrulmuş un və doşabdan bişirilən halva növü.

**TƏRXAN** *is.* 1. Orta əsrlərdə türk xalqlarında hökmdarların titulu.

2. Zaqafqaziya və Mərkəzi Asiyada, Kazan, Həştərxan xanlıqlarında feodalların dövlət vergilərindən azad edilmiş mülkü və torpağı.

**TƏRXİS** *is.* [*ər.*] *hərb.* Ordunun sülh şəraitinə keçdikdən sonra hərbi xidmətdən buraxılması. *Sıravi heyətin tərxisi.* ◻ **Tərxis etmək** – buraxmaq, ordu sıralarından azad etmək. *Ordunu tərxis etmək.* **Tərxis olunmaq** – buraxılmaq, ordu sıralarından azad olunmaq. [Qələndər:] *Bəli, tamam tərxis olunmuşam. Anam necədir?* Q.İlkin.

**TƏRXUN** *is.* Nazik, uzun yarpaqları yeməyə işlədilən çoxillik göyərti. *İki dəstə tərxun. – ..Kənarda keşniş, kəvər və tərxun ləkləri gözə çarpırdı.* Çəmənzəminli.

**TƏRİF** *is.* [*ər.*] 1. Bir şəxsin, ya şeyin yaxşı cəhətlərini, məziyyətlərini, müsbət xüsusiyyətlərini demə; mədh, vəsf. *İndi Sona gözəl cümlələr, tariflər .. dinləmək istəyirdi.* B.Bayramov. // Şöhrət, ad. *Əyri qılıncı belində; Tərifi mərdlər dilində.* "Koroğlu". ◻ **Tərif etmək** – b a x **təriфləmək**. *Vaqif zülflərini tərif edəndə; Gərəkdir ki, əvvəl yaza bənövşə.* M.P.Vaqif. *Əminə nə qədər diqqət versə də, Rayanın tərif etdiyi qızı görə bilmirdi.* M.S.Ordubadi.

2. Bir şeyin məzmununu, mahiyyətini, əsas xüsusiyyətlərini qısa şəkildə ifadə edən formul; xülasə. *Cümlənin tərifi. Okeanın tərifi. Məntiqi tərif.*

**TƏRİFƏGƏLMƏZ** *sif.* Hər cür tərifdən yüksək; çox gözəl, çox yaxşı. *Tərifəgəlməz gözəllik.*

**TƏRİFƏLAYİQ** *sif.* Tərifli, tərif edilməyə layiq olan, çox gözəl, əla. *Tərifəlayiq təşəbbüs.*

**TƏRİFLƏMƏ** "Tərifləmək"dən *f.is.*

**TƏRİFLƏMƏK** *f.* Tərif etmək, vəsf etmək, mədh etmək. *Yarış qabaqcıllarını tərifləmək.*

**TƏRİFLƏNMƏ** "Təriflənmək" dən *f.is.* *Büləndin təriflənməsindən acığı gəldiyi, həm də əsil mətləbə keçmək vaxtı olduğu üçün Sirat sözü dəyişib dedi.* Ə.Əbülhəsən.

**TƏRİFLƏNMƏK** *məch.* Tərif edilmək, vəsf edilmək, mədh olunmaq. *Yaxşı işinə görə təriflənmək. – Hər üç-dörd ayda, hər kənd təsərrüfat kampaniyasının axırında bir təriflənmək* [Rüstəm kişinin] *cirəsi idi.* M.İbrahimov.

**TƏRİFLİ** *sif.* Tərifəlayiq, tərifə dəyər, yaxşı, gözəl, təriflənməli. [Çingiz:] *Cəbi lələ, get, Piri babanın o tərifli balından kəs, gətir, yeyək.* S.S.Axundov.

**TƏRİFNAMƏ** *is.* [*ər.* tərif və *fars.* ...namə] Yaxşı işləməyə, yaxşı oxumağa, yarışda, baxışda və s.-də qabaqcıl yer tutduğuna görə birinə verilən rəsmi sənəd. *Orta məktəbi tərifnamə ilə bitirmək. Konkursda tərifnamə almaq. – Həmişə tərifnamə arzulayan Kosanın indi töhmət sözündən gözü bərələ qalmışdı.* S.Rəhimov.

**TƏRİQ** *is.* [*ər.*] *klas.* Yol. *Bir il əvvəl Varşava təriqi ilə Avropaya səfər edən bir İran* [vətəndaşı] *bir neçə gün Kiyev səfirinin müsafiri olmuşdu.* Çəmənzəminli. [Həmzənin] *böyük planları vardı, ticarətini Tiflis və Batum təriqi ilə İstanbula, oradan da o yana yeritmək istəyirdi.* Ə.Əbülhəsən.

**TƏRİQƏT** *is.* [*ər.*] *din.* Hakim dindən ayrılmış dini icma, islam məsləklərindən, məzhəblərindən hər biri. [Yaşlı kişi:] *Fəqət müxtəlif məzhəb və təriqətlərə mənsub olan müsəlmanlar hamısı bu barədə müttəfiq deyillər.* S.Hüseyn. *Şərqin dərdi böyükdür qədim tarixi qədər; Didir biri-birini təriqətlər, nəsillər.* B.Vahabzadə.

**TƏRİQƏTÇİ** *is.* Bu və ya digər təriqətə mənsub olan adam.

**TƏRİQƏTÇİLİK** *is.* Təriqətlərdən birinə mənsub olma.

**TƏRK**[1] *is.* [*fars.*]: **tərk etmək (eləmək)** – 1) qoyub getmək, çıxıb getmək, buraxıb getmək, atıb getmək. *Evi tərk etmək. Vətənini tərk etmək. – Reyhan səssiz tərk eləyir; Nənəsinin otağını.* M.Dilbazi; 2) yarımçıq qoymaq, daha davam etdirməmək, buraxıb getmək. *İşi tərk etmək. –* ..[Səməd bəy] *orta məktəbin*

*dördüncü sinfində dərsi tərk etdi.* Çəmənzəminli. **Tərkini qılmaq** – b a x **tərk etmək (eləmək)**. *Kərbəlayı Eyvaz bu səfər ev-eşiyin tərkini qıldı.* Çəmənzəminli.

**TƏRK**[2] b a x **tək**[2]. ..[Məlikməmməd] *quyunun tərkinə çatan kimi bir o yana-bu yana baxıb gördü ki, bir yol var.* Çəmənzəminli. *Dərənin tərkindən, göz güclə işləyən yerdən parıltı gəlir, ancaq su görünmür.* Mir Cəlal.

**TƏRK**[3] *is.* Atın belinin yəhər qoyulan yerinin dal tərəfi. *..Çavuş qəndabı içib, corabı aldı və qoydu atının tərkindəki xurcuna.* C.Məmmədquluzadə. *Sadıq kişi atın tərkinə bağlanmış dolu heybəni götürdü.* M.Hüseyn. ☐ **Tərk xurcunu** – atın tərkinə, yəhərin dalına qoyulan kiçik xurcun. *Tərk xurcununun bir gözündə bir neçə qutu qrim, on-on iki müxtəlif parik vardı.* Ə.Vəliyev. **Tərkinə mindirmək (almaq, götürmək)** – öz arxasında atın və ya başqa heyvanın tərkinə mindirmək, oturtmaq. *Aldı arxasına Qurban çobanı; Götürdü tərkinə igid Osmanı.* H.K.Sanılı; // eyni qaydada motosikletə, velosipedə və s.-yə mindirmək. *Yusif eyvanın başından motosikli endirdi, işə salıb, Şahmarı da tərkinə aldı.* B.Bayramov. **Tərkinə minmək** – atlının arxasına, minik heyvanının tərkinə minmək. *Bir nəfər ağ atlı* [Qəribin] *qabağına çıxıb salam verdikdən sonra dedi: – Gəl min tərkimə!* "Aşıq Qərib".

**TƏRKALTI** *is.* Yəhərin, at və ya başqa minik heyvanının tərkində olan dal hissəni. [Həsrət:] *Saxla, bala, keç tərkimə, yəhərdəki döşəkçəni də tərkaltının üstünə at.* B.Bayramov.

**TƏRKİB** *is.* [*ər.*] 1. Mürəkkəb bir şeyi əmələ gətirən hissələrin, şeylərin, ünsürlərin məcmusu. *Dilin lüğət tərkibi.* // Hər hansı kimyəvi birləşməyə, xəlitəyə, məhlula daxil olan maddələrin toplusu. *Kimyəvi birləşmənin tərkibi. Qazın tərkibi. Dəniz suyunun tərkibi.*

2. Müxtəlif element və ya maddələrdən ibarət birləşmə, xəlitə, məhlul. *Dərman tərkibləri. Dəriyə xüsusi tərkib hopdurmaq.*

3. Bir kollektivin, təşkilatın heyətini təşkil edən adamlar toplusu. *Komissiyanın tərkibi. Rəyasət heyətinin tərkibi.*

4. *dilç.* Bir neçə sözdən əmələ gələn birləşmə, ifadə, ibarə; söz birləşməsi. *Feli sifət tərkibi. Söz və tərkib. – Füyuzatçılar ərəb və fars sözlərini, tərkiblərini yerli-yersiz işlədir, dili zibilləyirdilər.* M.İbrahimov.

5. *mus.* Şüştər və hümayun dəsgahlarında muğam hissəsinin adı. *Tərkibin birinci ifadəsi ümumiyyətlə mayənin üst aparıcı tonu ilə başlanır.* Ü.Hacıbəyov.

**TƏRKİBBƏND** *is.* [*ər.* tərkib və *fars.* bənd] *ədəb.* Mövzu və vəzn etibarilə bir olub, müxtəlif qafiyə sisteminə malik klassik şeir formalarından biri. *Füzulinin "Mənəm ki qafiləsalari-karivani-qəməm" tərkibbəndi. S.Ə.Şirvaninin tərkibbəndləri.*

**TƏRKİBLİ** *sif.* Bir elementin tərkibinə daxil olan. *Xüsusi tərkibli maye. Mürəkkəb tərkibli cümlə.*

**TƏRKİ-DÜNYA** *is.* [*ər.*] *din.* Bu dünyanın nemətlərindən, zövq və səfasından əl çəkib, o dünyanın eşqi ilə yaşayan adam; asket, münzəvi. [Pərşan İntizariyə:] *Səni – tərki-dünya bir qocanı aclar qorxudur.* Ə.Məmmədxanlı.

**TƏRKİ-DÜNYALIQ** *is.* Bu dünyanın nemət və zövqü-səfasından əl çəkib, o dünyanın eşqi ilə yaşama; asketizm, münzəvilik.

**TƏRKİ-ƏDƏB** *is.* [*ər.*] Ədəb xaricində, ədəb və əxlaq qaydalarından kənarda olan iş, hərəkət və s.

**TƏRKİ-VƏTƏN** *is.* [*ər.*] Vətənini tərk edib başqa yerə getmə, başqa yerdə yaşama; calayi-vətən. *Nə Otello, nə Faustdur bizim qəhrəman; Nə də tərki-vətən olmuş Harolda bənzər.* S.Vurğun.

**TƏRKLƏŞMƏ** "Tərkləşmək"dən *f.is.*

**TƏRKLƏŞMƏK** *f.* Birisinin tərkinə minmək (b a x **tərk**[3]). [Səttar:] *Qal, axşam ikimiz tərkləşərik.* P.Makulu.

**TƏRKÖYNƏK** *is.* Altdan geyilən köynək, alt köynəyi. // Sif. mənasında. *Tərköynək uşaqlar Mədədin əl-ayağına sarındılar.* S.Rəhimov.

**TƏRK-SİLAH** *is.* [*ər.*] 1. Silahlarını əlindən alma, silahını, ya silahlarını atmağa məcbur etmə; silahsızlaşdırma. ☐ **Tərk-silah edilmək** – silahı əlindən alınmaq; silahsızlaşdırılmaq. [Əsgərlər] *çayın o tərəfi ilə yuxarı qalxdıqları vaxt səkkiz nəfər fin soldatının tərk-silah edilib gətirildiyini gördülər.* Ə.Vəliyev. [Ağagül:] *Yunkerlər tərk-silah edildi.* Ə.Məmmədxanlı. **Tərk-silah etmək** – silahlarını əlindən almaq; silahsızlaşdır-

maq. *Sergey bu zaman baş nəzarətçini yerə yıxıb tərk-silah etdi.* S.Vəliyev.

2. Bütün və hər cür silahlı qüvvələrin buraxılması, bütün silahların məhv edilməsi, yaxud silahlı qüvvələrin əsaslı surətdə ixtisar olunması və silahlanmanın məhdudlaşdırılması üçün həyata keçirilən tədbirlər.

**TƏRLAN** *is.* 1. *zool.* Güclü dimdiyi və uzun qanadları olan yırtıcı quş. *Bir yanında tərlanlar, dumanlı dağlar; Bir yanda kəkliklər, ayna bulaqlar.* M.Müşfiq. // *məc.* Obrazlı təşbehlərdə. *Doğrudan da getdikcə Solmazın yeri görünür, o şux tərlanın səsi eşidilmirdi.* S.Rəhimov. [Natiq:] *Ancaq heç biri mənim könlümün tərlanını ovlaya bilməz.* B.Bayramov.

2. *məc.* Qoçaq, igid, zirək, qəşəng mənasında. *Misri qılınc bağlamışam belimə; Tərlanların tavarına gəlmişəm.* "Koroğlu". *Əjdər o tərlanı basdı bağrına; Qadın tək ağlamaq gəldi arına.* H.K.Sanılı. // *məc.* Obrazlı təşbehlərdə qoçaq təyyarəçilərə verilən ad. *Uçun, tərlanlarım! Öpürəm sizi; Qəlbimdə döyünən saf qəlbinizi.* S.Vurğun.

**TƏRLƏDİCİ** *sif.* Tərlədən, tər əmələ gətirən, tər tökdürən. *Tərlədici dərman.*

**TƏRLƏMƏ** "Tərləmək"dən *f.is.*

**TƏRLƏMƏK** *f.* 1. Bədəni tərlə örtülmək, tər tökmək, dərinin məsamələrindən tər sızmaq. *İstidən tərləmək. Alnı tərləmək.* – *Bilqeyis həyəcanından tərləmişdi.* S.Vəliyev. *İşləməyə adət etmədiyindən* [Aydının] *əlləri tərləyib qabarlaşmışdı.* H.Seyidbəyli. // *məc.* Bir işlə çox və ciddi məşğul olmaq, bir şey üzərində işləməkdən çox yorulmaq. *Məsələnin həlli üzərində tərləmək.*

2. Çökmüş buxardan nəm olmaq, nəm çəkmək. *Hopduqca səhranın gövdəsinə su; Tərlədi qaxsımış bir bədən kimi.* S.Vurğun. *Qurumağa üz tutmuş ağaclar su içib cana gəldi, torpaq tərləməyə, nəfəs almağa, yenidən dirçəlməyə başladı.* Ə.Məmmədxanlı.

3. Bir tərəfi isti, o biri tərəfi soyuq olan boru, şüşə və s. kimi şeylər üzərində su damlaları əmələ gəlmək; nəmlənmək. *Pəncərənin şüşələri tərləyib. İstidən su borusu tərləyib.*

4. *məc. dan. zar.* İstəmədiyi halda xərcləməyə, verməyə məcbur olmaq (pul haqqında). *100 manat tərlədim.*

◊ **Bığ(ının) yeri (yenicə) tərləmək** – b a x **bığ**.

**TƏRLƏTMƏ** "Tərlətmək"dən *f.is.*

**TƏRLƏTMƏK** *f.* 1. Bir şeyin təsiri ilə tər əmələ gətirmək, tər tökdürmək, tərləməsinə səbəb olmaq. *İsti havada çay adamı tərlədir. Banka qoyub xəstəni tərlətmək.*

2. *məc.* Çox yormaq, üzmək, əldən salmaq. *Bu iş məni lap tərlətdi.*

**TƏRLİ** *sif.* 1. Tərləmiş, üstündə tər olan. *Tərli at. Tərli bədən.* – [Qadınlar və qızlar] *iki-üç kilometr piyada gəldiklərindən tərli üzləri qızarmışdı.* M.İbrahimov.

2. Tərdən islanmış. *Ana yurdun qız-gəlini! Yuyub qurudun; O qocanın əynindəki tərli köynəyi.* S.Vurğun.

3. Üzərində tər (3-cü mənada) olan. *Tərli şüşə.*

**tərli-tərli** *zərf* Tərli halda, tərli ikən, təri qurumamış. *Tərli-tərli soyuq su içmək olmaz.*

**TƏRLİK** *is.* 1. Yəhər altından atın belinə qoyulan keçə parçası. *Cəmil tərliyi Qaşqanın üstünə atıb onu həyətdən çıxardı.* Q.İlkin.

2. Keçmişdə yaşlı kişilərin papaq altından qoyduqları nazik parçadan tikilmiş baş geyimi. *Sətin tərlik.* – *Molla əmmaməsini yenə minbərin üst pilləsinə qoymuş, başında tərlik, yerə oturmuşdu.* P.Makulu.

3. İç tərəfdən ayaqqabının altına yapışdırılan nazik dəri, parça, karton və s. *Tuflinin tərliyi.*

**TƏRPƏDİLMƏ** "Tərpədilmək"dən *f.is.*

**TƏRPƏDİLMƏK** "Tərpətmək"dən *məch.* *Stol yerindən tərpədildi.* – *Dəyirmi dəyirman daşı yavaş-yavaş yerindən tərpədildi və sürütmənin üstünə mindirildi.* S.Rəhimov.

**TƏRPƏNİŞ** *is.* 1. Tərpənmə, hərəkət, tərpənti, canlanma.

2. Hərəkət, davranış, hərəkət tərzi. *Xəlilin hər addımında, hər tərpənişində özünün də yaxşı dərk edə bilmədiyi bir qürur vardı.* M.Hüseyn. *Səməd* [qadının] *üzünü görməsə də yerişindən, boy-buxunundan, tərpənişindən onun lap cavan olduğunu dərhal bildi.* İ.Hüseynov.

**TƏRPƏNİŞMƏ** "Tərpənişmək"dən *f.is.*

**TƏRPƏNİŞMƏK** *f.* Tərpənmək, hərəkətə gəlmək (çoxlu adam haqqında). *İclasdakılar bayaqdan çox belə şey eşitdiklərinə baxma-*

*yaraq, yenə də söz bura çatanda oturduqları yerdə tərpənişdilər*. Ə.Məmmədxanlı.

**TƏRPƏNMƏ** "Tərpənmək"dən *f.is.* ☐ **Yer tərpənmə** – zəlzələ.

**TƏRPƏNMƏK** *f.* 1. Yerindəcə hərəkət etmək, hərəkətə başlamaq, tərpəşmək, qımıldanmaq. *Tərpənməyir gecə yarı; Ağacların yarpaqları*. S.Rüstəm. [Eldar:] *Tələsməyin, mən deməmiş tula yerindən tərpənən deyil*. M.Rzaquluzadə. ☐ **Yer tərpənmək** – zəlzələ olmaq.

2. Yola düşmək, hərəkət etməyə başlamaq. *Telli isə qəti surətdə bir yana tərpənməyəcəyini bildirirdi*. S.Hüseyn. [Nərgiz:] *Tez ol ata, deyəsən, anagilin dəstəsi tərpənir..* Ə.Məmmədxanlı.

3. Bir işi görməyə başlamaq, bir işə girişmək, hərəkətə gəlmək. [Qönçə atasına:] *Bəlkə sən tərpənincə onlar gecənin birində məni apardılar?* Ə.Vəliyev.

**TƏRPƏNTİ** b a x **tərpəniş** 1-ci mənada. [Dərya:] *O kəsin ki ömrü zəlzələdə keçsin... yerin-göyün tərpəntisindən onun xəbəri çətin ki ola!* B.Bayramov.

**TƏRPƏŞMƏ** 1. "Tərpəşmək"dən *f.is.*

2. *is.* Hərəkət, canlanma, həyəcan. *Heyət üzvləri arasında tərpəşmə əmələ gəldi*. Ə.Vəliyev.

**TƏRPƏŞMƏK** *f.* 1. Hərəkətə başlamaq, hərəkətə gəlmək (çoxları haqqında).

2. B a x **tərpənmək** 1-ci mənada. *Hərdən külək əsər ki, yarpaq düşər; Ancaq onda suyum bir az tərpəşər*. A.Səhhət. [İzzət] *nə zarıyır, nə tərpəşir, nə xırıldayırdı*. Mir Cəlal.

**TƏRPƏTMƏ** "Tərpətmək"dən *f.is.*

**TƏRPƏTMƏK** *f.* 1. Hərəkətə gətirmək, hərəkət etdirmək; qımıldatmaq. *Kərim baba sükut ilə başını tərpətdi*. A.Şaiq. [Rəşid] *ani olaraq uzun kirpiklərini döyərək qara, nazik qaşlarını tərpətdi*. M.İbrahimov. // Əsdirmək, titrətmək, laxlatmaq, yerindən oynatmaq. *Basdırılmış ağacı tərpətmək olmaz*.

2. Hərəkətə gətirmək, getmək üçün hərəkət etdirmək. *Faytonçu atları tərpətdi*. Ə.Haqverdiyev. *Ayaz atı tərpədib həyətdən çıxdı*. Ə.Məmmədxanlı.

**TƏRS** *is.* və *sif.* 1. Bir şeyin əks tərəfi, arxası, dalı. *Nəzarətçi söyüş söydü və sağında dayanmış növbətçinin qırmızı yanağına əlinin tərsi ilə ağır bir şillə vurdu*. M.Hüseyn. [Veys] *..səliqəsiz qara bığlarını əlinin tərsi ilə silib, borc və nisyə dəftərlərini götürdü*. Ə.Əbülhəsən. // Parçanın və s. dal üzü (*avand* əksi). *Parçanın tərsi*.

2. Biri o birisinin əvəzinə və ya əksinə olan. *Ayaqqabını tərs geymək*.

3. Öz dediyindən, öz əməlindən, öz xasiyyətindən əl çəkməyən, tərslik edən; inad, höcət. [Mehralı:] *Musa çox tərs adamdır, sən onun dilini bilməzsən*. S.Rəhman. [Qızyetər:] *Rüstəm dayı əl qatmasa Şirzadın işi düzələn deyil. Elə bir tərsə rast gəlib ki!..* M.İbrahimov.

4. Acıqlı, hirsli, qaşqabaqlı. *Sarı özü də işlər müdirinin tərs baxışlarından bir növ mətləbi anlayırdı*. S.Rəhimov. *Mirzə yenə üzümə tərs baxdı*. Mir Cəlal.

5. Əksinə, tərsinə. [Məhəmməd:] *Ey müəllim, sən mənə neçə il dərs demisən; İndi belə görünür, hər şeyi tərs demisən.* B.Vahabzadə.

◊ **Tərs damarına düşmək (salmaq), tərs damarı (tərsliyi) tutmaq** – tərsliyə başlamaq, tərslik eləmək, dediyindən, öz əməlindən, öz bildiyindən əl çəkməmək; inad etmək. [İmran:] [Ananın] *tərs damarına düşdü, qurtardı.* M.Hüseyn. [Rüstəm:] *Görürsən tərs damarı tutub, danışma, çıx get, havası keçəndə qayıt..* M.İbrahimov. [Nisə xanım Zakirova:] *Nə qədər dedim ki, uşağa ayda bir-iki min cibxərcliyi göndər, saldın tərs damarına.* Ə.Məmmədxanlı. **Tərs damarını sındırmaq** – tərslikdən vaz keçməsinə nail olmaq, yumşaltmaq, yola gətirmək, razılığına nail olmaq. [Xəlil:] *..Yığsın başına dost-aşnanı, o Əliqulu kişinin tərs damarını sındırsın.* S.Rəhman. **Tərs kimi** – elə bil, acıqdan, əksinə. [Mərcan bəy:] *Tərs kimi kəbin pulu da beş min manat yazılıb.* Ü.Hacıbəyov. **Yumurtası tərs gəlmək** – əl-ayağa düşmək, bir yerdə qərar tapa bilməmək, özünə yer tapa bilməmək. **Yumurtası tərs gəlmiş toyuq kimi** – bir yerdə qərar tapa bilməyən, özünə yer tapa bilməyən adam haqqında.

**TƏRSA** *is.* [*fars.*] *klas.* Xristian, xaçpərəst, isəvi. *Tərsa qızı* (*xristian qız*). – *Qövmi-tərsayə mən tanıtdım rah.* Füzuli. *Sərasər sövdayi-eşqi tərsanın; Apardı əqlini Şeyx Sənanın*. Q.Zakir.

**TƏRSANƏ** *is.* [*ər.* darüssəna-dan] *is.* Gəmi düzəldilən və təmir olunan yer, verf, zavod.

**TƏRSƏ** *sif.* və *zərf* Tərs, əks, tərsinə, əksinə. *Hacının oğlu çox bədbin bir adamdır. Hər şeyə şübhə ilə baxır, hər sözdən tərsə bir məna çıxarmaq istəyir.* Qantəmir.

**TƏRSƏSİNƏ** *zərf* Əksinə, ziddinə, tərsinə. *Bəli, zəmanə dolandı və dəyirman tərsəsinə çevrildi..* C.Məmmədquluzadə.

**TƏRSİM** *is.* [*ər.*] Rəsm çəkmə, cızma.

**TƏRSİNƏ** b a x **əksinə**. *Diqqət edib baxsan əgər dərsinə; Hər şeyi təlim eləyir tərsinə.* M.Ə.Sabir. [Mozalan bəy:] *Amma burada işlər tərsinədir*. Ə.Haqverdiyev.

**TƏRSLİK** *is.* Tərs adamın xasiyyəti; inadcıllıq, inadçılıq, inadkarlıq, höcətlik. *Kolxoz sədri Qara kişinin tərsliyini bilirdisə də, yenə bir şey deməkdən özünü saxlaya bilmədi.* Ə.Əbülhəsən. ☐ **Tərslik eləmək (etmək)** – inad etmək, inadkarlıq göstərmək. [Lütfəli bəy:] *Şəfiqə, gəl sən tərslik eləmə, bircə dənə balana rəhmin gəlsin.* İ.Musabəyov. **Tərsliyi tutmaq, tərsliy(in)ə salmaq** – tərslik etmək, inadkarlıq göstərmək. *Tərsliyi tutan Həmzədən heç nə eşidə bilməyəcəklərinə qane olan qohum-qonşu arvadları çıxıb getdi.* Ə.Əbülhəsən. *Axırda Qədir tərsliyə salaraq böyük xalçanı üç yerə bölməyi təklif etdi.* Ə.Sadıq.

**TƏRTƏMİZ** *sif.* Lap təmiz, olduqca təmiz. *Qırxılıb çənəsi, buxaq tərtəmiz; Durur qabağında örtüklü bir miz.* H.K.Sanılı. [Nuriyyə:] *Stəkanları bir dəqiqənin içində yuyub tərtəmiz* (z.) *sildim*. İ.Əfəndiyev.

**TƏR-TƏZƏ** b a x **təptəzə**. *Tər-təzə otların ətri insanı bihuş edirdi*. C.Cəbrayılbəyli. *Bina təzə, ağac təzə, yer təzədir; Ördəklərin yuvası da tər-təzədir.* H.Hüseynzadə.

**TƏRTİB** *is.* [*ər.*] 1. Ayrı-ayrı hissələri, şeyləri seçib birləşdirərək tam bir şey əmələ gətirmə, düzəltmə, yaratma. *Dərsliyin tərtibi. Smeta tərtibi. Lüğət tərtibi. – İş məntəqələri, zavodlar, sexlər, emalatxanalar öz planlarını gözdən keçirir, yeni planlar tərtib edirdilər*. Ə.Sadıq.

2. Təşkil, təşkil etmə, yaratma, düzəltmə (qrup, kollektiv). *Bir neçə adamdan ibarət xor tərtib etmək. Yeni hökumət tərtib etmək.* // Hazırlamaq, düzəltmək. *Böyük bir ziyafət tərtib etdilər*.

3. B a x **tərtibat** 1-ci mənada.

4. Səliqə, səliqə-sahman, qayda, üsul, nizam. [Muzdur] *..ağ pal-paltarı öz tərtib və səliqəsilə bir-birinin üstünə* [yığdı]. S.M.Qənizadə. ☐ **Tərtibə salmaq** – qaydaya salmaq, səliqəyə salmaq, nizama salmaq. *İzin olsa, məhəbbətlə deyərdim sənə, saqi! Sal məclisi tərtibə səbəbkar gəlincə.* Ə.Vahid.

5. Yazma, inşa. ☐ **Tərtib etmək** – yazmaq, inşa etmək. *Nemətullayev hər haqq-hesabı düzgün saxladığından nəticədə təftiş komissiyası gözəl bir akt tərtib edər və burada Nemətullayevin mükafatlanmasını irəliyə sürərdi.* S.Rəhimov.

6. *mətb*. Çap üçün mətbəə şriftlərinin bir yerə gətirilərək düzülməsi, yığılması, mürəttib işi; mürəttiblik.

**TƏRTİBAT** *is.* [*ər.* "tərtib" söz. cəmi] 1. Tərtib olunmuş bir şeyin xarici görünüşünü, görkəmini təşkil edən xüsusiyyətlərin (kitabın, qəzetin şəkillərinin, şriftlərinin, ya səhnə tamaşasının dekorasiya və geyimlərinin və s.-nin) məcmusu. *Səhnəyə müəyyən bir rəssam tərtibat vermirdi*. S.Rəhman.

2. B a x **tərtib** 1-ci mənada. *Külliyyatın tərtibatı, müqəddiməsi və qeydləri professor M.Arifindir*.

**TƏRTİBATÇI** *is.* Tərtibat işləri ilə məşğul olan, kitabın, tamaşanın tərtibatını verən adam. // Sif. mənasında. *Tərtibatçı rəssam.*

**TƏRTİBÇİ** *is.* Tərtib işləri ilə məşğul olan, tərtib edən adam. *Lüğətin tərtibçisi. Tənqidi mətnin tərtibçisi.*

**TƏRZ** *is.* [*ər.*] 1. Üsul, qayda. *Ey dilbərana tərzdə cövlan edən çocuq!* M.Ə.Sabir. *Arvad gözucu vərəqəyə baxıb, bir ağzının qalın dodaqlarını iyrənc bir tərzdə büzdü.* H.Seyidbəyli.

2. İzafət birləşməsinin birinci tərəfi kimi işlədilir; məs.: *tərzi-hərəkət* (*hərəkət tərzi*), *tərzi-təfəkkür* (*təfəkkür tərzi*), *tərzi-həyat* (*həyat tərzi*).

**TƏSADÜF** *is.* [*ər.*] 1. Baş vermiş gözlənilməyən, nəzərdə tutulmayan hadisə; qəziyyə, vəqə, əhvalat. [Tosya Fəraməzə:] *Neçin bir neçə ay əvvəl təsadüf bizi bir-birimizə rast gətirdi?* Çəmənzəminli.

2. Gözlənilmədən rastlaşma, görüşmə. *Məhərrəm bu təsadüfdən çox sevindi.* H.Nəzərli.

☐ **Təsadüf etmək** – 1) gözlənilmədən rast gəlmək, birdən qarşısına çıxmaq. *O günün sabahı məktəbə gedərkən* [qıza] *təsadüf etmədim*. S.Hüseyn; 2) görmək, rastlaşmaq. *Arasıra istidən divarın dibindəki kölgəliyə qısılaraq yeriyənlərə də təsadüf etmək mümkündür.* M.İbrahimov. *İndi vaqonlarda bir-iki sərnişinə təsadüf etmək olurdu*. H.Seyidbəyli.

3. Hal, vəziyyət. *Təliə bir çox təsadüflərdə Əbubəkrin ona diqqət verib-vermədiyini də öyrənməyə çalışırdı*. M.S.Ordubadi. // Gözlənilmədən ortaya çıxan keyfiyyət, hadisə, şərait. [Arif Rənaya:] *Nə səadət, nə xoş təsadüf, inan; Səni gördükdə bitdi tabü-təvan.* H.Cavid. *Uşağı bir xoşbəxt təsadüf saxladı*. Mir Cəlal.

**TƏSADÜFƏN** *zərf* [*ər.*] Gözlənmədən, gözlənilmədən, təsadüfi olaraq, təsadüfi. *Təsadüfən Nəbi o gün yoldaşlarını Dəvəboynuna göndərmişdi*. "Qaçaq Nəbi". *Haman qəribə* "*ovçunun*" *təsadüfən vurduğu bu göyərçini götürüb yarasını yoxladım*. M.Rzaquluzadə.

**TƏSADÜFİ** *sif.* [*ər.*] 1. Nəzərdə tutulmadığı, gözlənilmədiyi halda baş verən, təsadüf nəticəsində olan. *Təsadüfi görüş. Təsadüfi uyğunluq. – Rüstəm* [Şərəfoğluna] *üçüncü dəfə tamamilə təsadüfi olaraq, 1942-ci ildə Ukraynada rast gəldi.* M.İbrahimov.

2. Hərdənbir, təsadüfdən-təsadüfə olan, baş verən, əldə edilən; daimi olmayan. *Təsadüfi gəlir.*

3. Lazımi qədər əsası, səbəbi olmadığı halda, səbəbsiz törəyən, zərurətdən doğmayan, qanunauyğun törəməyən. "*Anamın kitabı*"*nı Cəlil Məmmədquluzadə yaradıcılığında təsadüfi bir hadisə hesab etmək olmaz.* M.İbrahimov.

**TƏSBEH** *is.* [*ər.*] Zikr edilən duaları saymaq, indi isə məşğuliyyət üçün istifadə edilən sapa keçirilmiş muncuq və s. dənələri düzümü. *Molla İbrahimxəlil sabah vaxtı səccadə üstündə başında əmmamə, əlində uzun təsbeh, dizi üstə oturub övrad oxumağa məşğuldur*. M.F.Axundzadə. *Mirzə Cəmil kəhrəba təsbehini əlinə alıb, əsəbi halda çevirir, muncuqların şaqqıltısından həzz alırdı.* Ə.Vəliyev.

**TƏSBİT** *is.* [*ər.*] Əvvəl deyilmiş bir sözün, fikrin və s.-nin düzgünlüyünü təsdiq etmə, qəbul etmə, sabitləşdirmə. *Konstitusiyada təsbit olunmuş hüquqlar. Lüğətdə təsbit edilmiş sözlər*. // Bir şeyin doğruluğunu sübut edən dəlil.

**TƏSDİQ** *is.* [*ər.*] Deyilən sözün, başqasının mülahizəsinin, yaxud bir sənədin, faktın və s.-nin gerçək olduğunu iqrar etmə, təsdiqləmə. // Yəqinlik. [Ağasəfər] *pis xəbərin təsdiqini eşidəcəyindən qorxdu, qondarma bir vəcdlə ətrafına işarə edib dedi...* Ə.Əbülhəsən. ☐ **Təsdiq etmək** – 1) bir şeyin gerçək olduğunu qəbul etmək; təsdiqləmək. [Sədr:] *Məsələ aydındır, aldığımız materiallar vətəndaş Yaqut Niyaz qızının sözlərini təsdiq edir.* C.Cabbarlı; 2) bir şeyin düzgünlüyünü rəsmiləşdirmək, qanuni şəklə salmaq. *Diplomun surətini təsdiq etmək*; 3) rəsmi olaraq qəti qərar çıxarmaq, qəti şəklə düşmüş hesab etmək. *Gündəliyi təsdiq etmək. Tezisləri təsdiq etmək. Mövzunu elmi şurada təsdiq etmək. Əsəri çapa təsdiq etmək.*

**TƏSDİQEDİCİ** *sif.* Təsdiq edən, gerçəkliyini, doğruluğunu, həqiqiliyini qəbul edən; razılıq, təsdiq, qəbul bildirən. *Təsdiqedici cavab. Təsdiqedici nəzər.*

**TƏSDİQLƏMƏ** "Təsdiqləmək"dən *f.is.*

**TƏSDİQLƏMƏK** *f.* Təsdiq etmək. *Məclisdəkilər də mehtər Murtuzun sözünü təsdiqlədilər*. "Koroğlu". *Gülxan Gülşənin dediklərini təsdiqlədi*. Ə.Vəliyev.

**TƏSDİQNAMƏ** *is.* [*ər.* təsdiq və *fars.* ...namə] Bir şeyin təsdiq edilməsi haqqında rəsmi kağız, sənəd.

**TƏSƏDDÜQ** *is.* [*ər.*] Sədəqə vermə; yoxsullara, dilənçilərə verilən pul və s.; sədəqə. ☐ **Təsəddüq etmək** – sədəqə vermək.

**TƏSƏK** *is.* Adətən gecə başa qoyulan toxunmuş və ya parçadan tikilmiş papaq; araqçın. *Nə əynində arxalıq görürəm, nə başında naxışlı təsək.* R.Rza. *..Sonanın atası başında təsək, gözlərində eynək olduğu halda.. məcmuələrdən cürbəcür məlumatlar oxuyardı.* Ə.Əbülhəsən.

**TƏSƏLLİ** *is.* [*ər.*] Bir acını az da olsa unutduracaq, dərdi, qəmi yüngülləşdirəcək, təskin edəcək söz, nəsihət və ya yaxşılıq; ovundurma, təskinlik. *Bir təsəllidir sənə ol söz ki derlər var sübh*. Füzuli. *Bu təsəlli mənə bəsdir, olar asudə halım.* A.Səhhət. ☐ **Təsəlli vermək** – dərdinə, qəminə şərik olub onu sakitləşdirmək, ürək-dirək vermək, təskinlik vermək.

*Zərnigar dərdini deyib, başladı ağlamağa. Qarı qıza təsəlli verib, durub gəldi padşahın yanına.* (Nağıl). *Elə bil* [Məşədibəy] *əlini Səlimin çiyninə qoyub təsəlli verirdi.* M.Hüseyn. **Təsəlli tapmaq** – sakitləşmək, dərdini unutmaq.

**TƏSƏLLİVERİCİ** *sif.* Təsəlli verən, təsəlliyə səbəb olan; təskinedici. *Təsəlliverici xəbər.*

**TƏSƏRRÜF** *is.* [*ər.*] 1. Yiyələnmə, zəbt etmə.

2. Qənaətlə işlətmə.

**TƏSƏRRÜFAT** *is.* [*ər.*] 1. *iqt.* Hər hansı bir ictimai quruluşun istehsal üsulu, istehsal münasibətlərinin məcmusu. *Kapitalist təsərrüfatı. Natural təsərrüfat. Sadə əmtəə təsərrüfatı. Kapitalist təsərrüfat sistemi.*

2. İstehsala xidmət edən, istehsalı təşkil edən, onun üçün olan hər şey; iqtisadiyyat. *Xalq təsərrüfatı.*

3. İstehsalın hər hansı bir sahəsi, habelə hər hansı istehsal vahidi. *Şəhər təsərrüfatı. Meşə təsərrüfatı. – Nəticədə kənd təsərrüfatı dağılır, kəndli torpağı buraxıb şəhərlərə qaçırdı.* M.S.Ordubadi. // Hər hansı istehsala və ya istehsal vahidinə aid olan avadanlıq, inventar, tikili və s. *Kolxoz təsərrüfatı. Yol təsərrüfatı.* // Kənd təsərrüfatının, alətləri, istehsal vasitələri, əkin yerləri, heyvanları və s. olan istehsal vahidi. *Xırda kəndli təsərrüfatı.*

4. Məişət və ev ehtiyaclarını təmin etmək üçün lazım olan vəsaitin məcmusu. *Tamaşa bütün ailəsini kənddən, təsərrüfatdan ayıraraq stansiyaya, rayon mərkəzinə gətirmişdi.* Ə.Əbülhəsən. [Cəlalın atası] *..kiçik bir təsərrüfat düzəldə bilmişdi.* S.Vəliyev. // İdarədə, müəssisədə və s.-də lazım olan şeylərin məcmusu. *Təsərrüfat şöbəsi. Direktorun təsərrüfat üzrə müavini. – Təsərrüfat müdiri lampanı rəfdən götürüb ortalığa gətirdi və kibriti Rəhimə verdi.* Ə.Sadıq.

**TƏSƏRRÜFATÇI** *is.* Sənayenin, kənd təsərrüfatının hər hansı sahəsinin təsərrüfatına rəhbərlik edən adam. *Təsərrüfatçı* [Qədirə] *qırıq bir taxt göstərib dedi: – Hələlik ötüş!* Mir Cəlal.

**TƏSƏRRÜFATÇILIQ** *is.* Təsərrüfatı yaxşı, qənaətlə idarə etmə bacarığı.

**TƏSƏRRÜFATSIZLIQ** *is.* Təsərrüfatı idarə edə bilməmə və ya pis idarə etmə nəticəsində əmələ gələn vəziyyət, pozğunluq, qənaətsizlik. *Təsərrüfatsızlığa qarşı mübarizə.*

**TƏSƏVVÜF** *is.* [*ər.*] bax **mistika**.

**TƏSƏVVÜR** *is.* [*ər.*] 1. Xəyala gətirmə, xəyalən göz qabağına gətirmə. *Ucsuz-bucaqsız bir meşə təsəvvür edin. – Xanım .. Qafqazın şəklini xəyalına gətirərək onu füsunkar bir ölkə kimi təsəvvür edirdi.* Çəmənzəminli. // Xəyal, fikir. *Sədrin təsəvvüründə arzu etdiyi düz və ayna kimi yollar parıldamağa başladı.* S.Rəhimov.

2. Bir şeyi, adamı fikrində canlandırma, zehində surət vermə, bir fikirdə olma. *Mən bu işi başqa cür təsəvvür edirdim.*

3. Bir şey, bir adam haqqında bilik, ümumi tanışlıq. *Heç bir təsəvvürü yoxdur. Botanikadan ümumi təsəvvürü var.*

4. Fikir, xəyal, təxəyyül. *Tahirin gözləri dənizə baxır, amma təsəvvüründə yalnız və yalnız Lətifə dolanırdı.* M.Hüseyn. *Qəhrəmanın təsəvvüründə iki ata, iki oğul canlanırdı.* S.Rəhimov.

5. *fəls. psix.* Olmuş hadisəni xəyalına gətirmə, zehində canlandırma. *Təsəvvür prosesi.* // Əvvəllər hiss orqanlarına təsir etmiş, indi isə bilavasitə təsir etməyən, lakin xəyalda əks olunan əşya və hadisələrin konkret surəti.

**TƏSHİH** *is.* [*ər.*] 1. Yazı və s.-də səhvləri, nöqsanları düzəltmə; düzəliş. ☐ **Təshih etmək** – düzəliş aparmaq, düzəltmək. *Firidun öz məqaləsini bir də oxudu, .. bəzi təshihlər etdi.* M.İbrahimov.

2. *köhn.* Korrektura. *İftadə mətbəə əməkçisi idi. Təshihə baxar və arabir şeir də yazardı.* Çəmənzəminli.

**TƏSXİR** *is.* [*ər.*] Ələ keçirmə, zəbt etmə.

**TƏSİR** *is.* [*ər.*] 1. Əsər etmə və bunun nəticəsində əmələ gələn hal, əlamət, iz. *Təsir altında olmaq. Təsir altına düşmək. Günəş şüalarının bədənə xoş təsiri. – Küləyin təsirindən sonra ocağın qırağında oturmaq Giləyə o qədər xoş gəldi ki...* Ə.Vəliyev. ☐ **Təsir etmək** – 1) əsər etmək, təsiri olmaq, nüfuz etmək. *Söz ona təsir etmir. Nə qədər dedik, təsir etmədi. Dərman yaxşı təsir etdi;* 2) riqqətləndirmək, kədərləndirmək. *Bu səs adama ağır təsir edir. Xəbər bizə çox təsir etdi. – Bu sözlər Göyüşə təsir etdi.* Mir Cəlal. ...**təsiri**

**bağışlamaq** – bir şey haqqında bu və ya başqa fikir oyatmaq, təsəvvür yaratmaq.

2. Müəyyən bir enerjinin, gücün, qüvvənin özünü büruzə verməsi, göstərməsi. *Mexaniki təsir. Qüvvənin cismə təsiri.*

**TƏSİREDİCİ** *sif.* Təsir edən, təsir göstərən, təsirli. *Hüseyn çox mülayim və təsiredici səsi olan bu müəllimin danışıqlarına diqqətlə qulaq asırdı.* S.Rəhimov.

**TƏSİRLƏNMƏ** "Təsirlənmək"dən *f.is.*

**TƏSİRLƏNMƏK** *f.* Təsir altına düşmək, bir şeyin təsirini hiss etmək. // Kədərlənmək, doluxsunmaq, riqqətə gəlmək, mütəəssir olmaq. *Kişi daha da təsirləndi.* Mir Cəlal.

**TƏSİRLİ** *sif.* Təsir edən, təsir göstərən, təsiri olan, təsiredici. *Təsirli musiqi. Təsirli dərman. – Xoş və təsirli bir səs meşəyə yayıldı.* Ə.Sadıq. *Mən bu təsirli musiqinin və nəğmənin hələ çox uzanmasını arzu edirdim.* M.Rzaquluzadə.

◊ **Təsirli feil** *qram.* – vasitəli tamamlıq tələb edən feil. "*Yumaq*" *və* "*oxutmaq*" *təsirli feillərdir*.

**TƏSİRLİK** *is.*: **təsirlik hal** *qram.* – ismin kimi, nəyi (müəyyən təsirlik hal), bəzən də kim, nə (qeyri-müəyyən təsirlik hal) suallarına cavab olan halı.

**TƏSİRLİLİK** *is.* Təsir etmə; təsir qabiliyyəti (gücü). *Dərmanın təsirliliyi. Musiqinin təsirliliyi.*

**TƏSİRSİZ** *sif.* Təsir etməyən, təsir göstərməyən, heç bir təsiri olmayan, nüfuz etməyən. *Təsirsiz nitq.*

◊ **Təsirsiz feil** *qram.* – vasitəsiz tamamlıq tələb edən feil. "*Yuyunmaq*" *və* "*yatmaq*" *təsirsiz feillərdir.*

**TƏSİRSİZLİK** *is.* Təsir etməmə, nüfuz etməmə, heç bir təsiri olmama. *Dərmanın təsirsizliyi. Sözün təsirsizliyi.*

**TƏSİS** *is.* [*ər.*] Əsasını, binasını, təməlini qoyma; qurma, yaratma. ☐ **Təsis etmək** – əsasını, təməlini qoymaq, yaratmaq. *O vaxtlar hökumət təsis edən məktəblərin proqramında xala xətrin qalmasın babətindən həftədə bir neçə saat* [Azərbaycan] *dili dərsi deyilirdi.* C.Məmmədquluzadə. *Ə.Haqverdiyev aktyor C.Zeynalovla birlikdə daimi teatr cəmiyyəti təsis etməyə çalışmış, lakin münasib şərait olmadığından bir nəticə əldə edə bilməmişdir.* C.Cəfərov.

**TƏSİSAT** *is.* [*ər.* "təsis" söz. cəmi] *kit.* 1. Qurulmuş, təsis edilmiş, yaradılmış müəssisələr, idarələr, qurğular.

2. İctimai idarə; ictimai quruluşun, nizam və qaydanın bu və ya başqa forması. *Siyasi təsisat.*

**TƏSKİN** *is.* [*ər.*] Sakitləşdirmə, təsəlli vermə; sakitlik, təsəlli. *Dərdli könüllərə təskindir şerim.* S.Rüstəm. ☐ **Təskin etmək** – sakitləşdirmək, təskinlik vermək, rahatlandırmaq, təsəlli vermək. *Bu xəbərlərin heç birisi Həcər xanımı təskin etmirdi.* S.Hüseyn. [Züleyxa] *..pis də yaşamadım, – deyib özünü təskin etmişdi.* M.İbrahimov. **Təskin tapmaq** – b a x **təskinlik tapmaq** ("**təskinlik**"də). [Bəhram:] *Mən qızdırmalı kimiyəm. Bu çiçəkləri iyləyim, bəlkə bir az təskin tapım.* C.Cabbarlı.

**TƏSKİNEDİCİ** *sif.* Sakitləşdirici, rahatlandırıcı, təsəlliverici. *Toxtamış Səba xanıma müraciət edərək həyəcanını təskinedici bir surətdə dedi: – Həyatda bu cür hadisələr çox ola bilər.* M.S.Ordubadi. [Bahar] .. *təskinedici sözlər danışıb* [Sonanı] *..mətanətli olmağa çağırırdı.* B.Bayramov.

**TƏSKİNLİK** *is.* Sakitlik tapma, rahatlıq tapma, təsəlli tapma, aram tapma; sakitlik, rahatlıq, təsəlli. *Sevgilin həsrətlə baxır üzünə; Səndən söz istəyir, təskinlik umur.* N.Xəzri. ☐ **Təskinlik tapmaq** – sakit olmaq, rahat olmaq, təsəlli tapmaq, sakitləşmək, aram tapmaq. [Kərbəlayı:] *Nə edim? Allah məni fəqir yaradıb, – sözləri ilə təskinlik tapırdı.* Çəmənzəminli. *..Züleyxa heç bir şeylə təskinlik tapmırdı.* S.Vəliyev. **Təskinlik vermək** – sakit etmək, təsəlli vermək. [Sərdarlı] *gözləri ilə qızına sanki təskinlik verirdi.* Q.İlkin. [Bəhlul:] *Psixologiya elminin köməkliyi ilə özümə təskinlik verirdim.* B.Bayramov.

**TƏSLİM** *is.* [*ər.*] 1. Bir şeyi lazımi yerinə və ya şəxsə vermə, tapşırma. ☐ **Təslim etmək** – lazımi yerinə və ya şəxsə vermək. [Zeynalın] *əlindəki kitabları tərcümə edib təslim etməyincə yeni kitab götürməyə də imkanı yoxdu.* S.Hüseyn. [İnsan] *axırda bütün ömrü boyu qazandıqlarını təslim etməli, qoyub getməli olur.* Mir Cəlal.

2. Müharibədə, mübarizədə öz məğlubiyyətini etiraf edərək müqaviməti dayandırma. ☐ **Təslim olmaq** – müqavimətdən ümidini kəsərək hərbi əməliyyatı dayandırmaq, düşmənin irəli sürdüyü şərtlər əsasında ona tabe olmaq, silahı yerə qoymaq. *Düşmən ordusu təslim oldu. Qaçaqlar təslim oldular. – Lakin Qara Məlik təslim olmadı.* M.S.Ordubadi. *Yolunu kəssə də ölüm anbaan; Təslim olmayacaq bizim qəhrəman.* M.Rahim; // mübahisədə, yarışda, güləşdə və s.-də müqavimətini dayandırmaq.

3. Güzəştə getmək, razı olmaq, öz dediyində, tələbində daha israr etməmək. *Əvvəlcə deyilənlərə razı olmadı, sonra təslim oldu. – Fazilov jurnalı pəncərəyə qoyub əllərini göyə qaldırdı: – Almaz xanım, mən təslim!* Mir Cəlal.

4. *məc.* Tabe olma, ram olma. ☐ **Təslim olmaq** – 1) tabe olmaq, ram olmaq. *Təslim olmuş dalğalar; Polad adacıqların; Ayağını yaladı.* İ.Səfərli; 2) Çətinliklər qarşısında geri çəkilmək, tamahını saxlaya bilməmək. *Qəhrəman bir an da olsun çətinlik və maneələr qarşısında təslim olmamalıdır.*

◊ **Canını (ruhunu) təslim etmək** – b a x **can**.

**TƏSLİMÇİ** *is. siyasi* Çətinliklər qarşısında təslim olan, xaincəsinə geri çəkilən adam.

**TƏSLİMÇİLİK** *is. siyasi*. Təslimçinin hərəkəti; mübarizəni davam etdirməkdən xaincəsinə boyun qaçırma.

**TƏSNİF**[1] *is.* [*ər.*] 1. Hər hansı fərqlənmə əlamətlərinə və ya xüsusiyyətlərinə görə siniflərə, qruplara, dərəcələrə ayırma; təsnifat. *Balıqların* (*heyvanların, bitkilərin*) *təsnifi*. *– Kitabda dərman növlərinə aid verilən təsnif rus alimlərinin.. nəzəriyyələrinə əsaslanmışdır.* A.Əliyev. ☐ **Təsnif etmək** – hər hansı fərqlənmə əlamətlərinə və xassələrinə görə siniflərə, qruplara, dərəcələrə ayırmaq. *Mineralları təsnif etmək. Məfhumları təsnif etmək.*

2. *köhn.* Kitab tərtib etmə; təlif.

**TƏSNİF**[2] *is.* [*ər.*] *mus*. Dəsgah şöbələri arasında əvvəlkinə nəhayət vermək sonrakına keçmək üçün ifa olunan mahnı formasına bənzər dəqiq və sabit ölçülü nəğmə. *Hümayun təsnifi*. *– Aydın vəzndə olan musiqiyə xalq mahnıları, müxtəlif xalq rəqs havaları, habelə təsniflər* (*vokal musiqisi*) *və rənglər* (*çalğı musiqisi*) *daxildir*. Ü.Hacıbəyov.

**TƏSNİFAT** *is.* [*ər.* "təsnif" söz. cəmi] Hər hansı eynicinsli şeylərin və ya anlayışların müəyyən ümumi əlamətlərə görə siniflərə, qruplara, bölmələrə ayrılması sistemi; klassifikasiya. *Bitkilərin təsnifatı. Mineralların təsnifatı.*

**TƏSNİFATÇI** *is.* Təsnifat mütəxəssisi; klassifikator.

**TƏSRİF** *is.* [*ər.*]: **felin təsrifi** *qram*. – felin şəxs, kəmiyyət və zamana görə dəyişməsi.

**TƏSVİB** *is.* [*ər.*] Bəyənmə, təsdiq. *Komisyon məsələnin həll olunması yolunu tapıb, təsvib üçün dövlətə və əncümənə versin.* M.İbrahimov. ☐ **Təsvib etmək** – bir fikir və ya hərəkətin, işin doğru olduğunu söyləmək; bəyənmək, təsdiq etmək, alqışlamaq, tərifəlayiq bilmək. [Çopo:] *Xaqan hər kəsi dinlədikdən sonra mənim rəyimi təsvib etdi.* Çəmənzəminli.

**TƏSVİBEDİCİ** *sif.* Təsvib ifadə edən, təsdiqedici, tərifləyici. *Təsvibedici cavab. Təsvibedici alqışlar. – Qonaqlar təsvibedici sima ilə başlarını tərpətdilər.* Çəmənzəminli.

**TƏSVİR** *is.* [*ər.*] 1. Şeyin surətini, şəklini çəkmə; şəkil, rəsm. *Mənzərə təsviri.*

2. Bir adam və ya şey haqqında yazılı, ya şifahi surətdə nəql etmə, danışma. *Şərifzadə vəziyyəti* [Mehribana] *lazımınca təsvir etmiş, əlavə olaraq demişdi..* S.Hüseyn. *..Tehran qəzetləri dediyimiz fikri sübut edən qəribə bir əhvalatın təsvirilə dolu idi*. M.İbrahimov.

3. Elmi məqsədlə bir şeyin xüsusiyyətlərini, əlamətlərini və s.-ni müntəzəm şəkildə şərh və ifadə etmə. *Ləhcələrin xüsusiyyətlərini təsvir etmək.* // Bir şeyin sanki rəsmini çəkər kimi onu gözəl surətdə tərif etmə. *Üfüqdə günün batması elə gözəl görünürdü ki, təsvir etmək mümkün deyildir*. M.Rzaquluzadə.

**TƏSVİRÇİ** *sif.* İşin və ya şeyin mahiyyətinə deyil, xarici görünüşünün təsvirinə həddən artıq fikir verən sənətkar (rəssam, qrafika ustası, heykəltəraş, yazıçı, şair).

**TƏSVİRÇİLİK** *is.* İncəsənət və ədəbiyyatda: hadisələrə üzdən yanaşma, onların dərin mahiyyətinə deyil, zahiri görünüşlərinin təsvirinə meyil etmə. *Bu əsər təsvirçilikdən başqa bir şey deyil.*

**TƏSVİRƏGƏLMƏZ** *sif.* Çox gözəl, çox maraqlı, çox təsirli olduğu üçün təsvir oluna bilməyən; əla. *Təbriz baharının təsvirəgəlməz bir gözəlliyi var*. M.İbrahimov.

**TƏSVİRİ** *sif.* [*ər.*] Təsvirlə əlaqədar olan, təsvir olunan, bir şeyi əyani surətdə təsəvvür etməyə, təsvir etməyə kömək edən. *Təsviri üsul.*

◊ **Təsviri sənət (incəsənət)** – səth üzərində bədii təsvir (incəsənət) növlərinin ümumi adı (rəngkarlıq, qrafika, heykəltəraşlıq).

**TƏSVİYƏ** *is.* [*ər.*] Ləğv, aradan qaldırma. □ **Təsviyə etmək** – 1) ləğv etmək, fəaliyyətini dayandırmaq, bağlamaq. *Şamaxı İcraiyyə Komitəsinə əmr olunurdu ki, ərzaq idarəsini tezliklə təsviyə etsin*. Qantəmir; 2) ödəmək, vermək, əda etmək. *Borcunu təsviyə etmək.*

**TƏSVİYƏÇİ** *is. tar.* Təsviyəçilik tərəfdarı olan adam.

**TƏSVİYƏÇİLİK** *is. tar.* 1908-1912-ci illərdə RSDFP-də proletariatın qeyri-leqal inqilabi partiyasını təsviyə (ləğv) etməyə və inqilabi mübarizənin zəruriliyini inkar etməyə çalışan irticaçı menşevik cərəyanı.

**TƏŞBEH** *is.* [*ər.*] 1. Bənzər, oxşar; bənzətmə, oxşatma, bənzəmə, oxşama. *Ağ günə təşbehdir sənin cəmalün; Eşqindən salmışam aləmə bir ün.* M.P.Vaqif. *Oxşarı, təşbehi, kölgəsi deyil; Dünyada hər şeyin özü gözəldir.* B.Vahabzadə.

2. *ədəb.* Bədii əsərdə bir hadisəni, adamı və ya şeyi başqa bir hadisəyə, adama və ya şeyə bənzətməkdən ibarət məcaz. *Realizm və xəlqilik Vaqifin seçdiyi mövzularda, dil və təşbehlərdə də özünü göstərir.* M.İbrahimov. *Səmədin o dövrdəki ədəbi dili təşbehlər, idiomlarla dolu canlı xalq dilidir*. O.Sarıvəlli.

**TƏŞBEHLİ** *sif.* Təşbehi olan, təşbehlə ifadə olunan (b a x **təşbeh** 2-ci mənada). *Təşbehli ifadə. Təşbehli təsvir.*

**TƏŞDİD** *is.* [*ər.*] Ərəb əlifbasında samit hərfin iki dəfə oxunması üçün onun üzərinə qoyulan işarə (məs.: – şiddət, hiddət və s.).

**TƏŞƏBBÜS** *is*. [*ər.*] 1. Bir işə başlama, iqdam etmə. *Rzaquluxan hansı təşəbbüsə başladısa da, yarımçıq qaldı.* M.S.Ordubadi. [Mürşüd:] *Özün də bilirsən ki, bu iş bizim təşəbbüsümüzdür*. S.Rəhman. □ **Təşəbbüs qaldırmaq** – yeni təşəbbüs irəli sürmək, qarşısına yeni məqsəd qoymaq. [Qərənfil:] *İnişil təşəbbüs qaldırdınız ki, hamam tikək, hələ hörgüsü bir arşın qalxmayıb.* İ.Əfəndiyev. // Hər hansı bir işdə rəhbər rol, birincilik, başçılıq. *Təşəbbüsü əldən verməmək. Rəqib komandanın təşəbbusü.*

2. Təşəbbüskarlıq; müstəqil, fəal hərəkət etmək qabiliyyəti. [Firəngiz Cəbrayıla:] *Mən səndə hələ cəsarətli bir ..təşəbbüs görməmişəm.* B.Bayramov.

**TƏŞƏBBÜSÇÜ** *is.* Hər hansı işə başlamaq niyyətində olan, buna təşəbbüs göstərən adam; təşəbbüskar. [İldırımov:] *Bir-iki kəlmə danışmaq üçün ilk təşəbbüsçüyə söz verilir, – dedi.* S.Rəhimov.

**TƏŞƏBBÜSÇÜLÜK** *is.* Təşəbbüs göstərmə, bir işi birinci olaraq başlama; təşəbbüskarlıq.

**TƏŞƏBBÜSKAR** [*ər.* təşəbbüs və *fars.* ...kar] b a x **təşəbbüsçü**.

**TƏŞƏBBÜSKARLIQ** *is.* Təşəbbüskar olma, təşəbbüs irəli sürmə; təşəbbüsçülük. *Təşəbbüskarlıq gənclərin əsas xüsusiyyətidir.*

**TƏŞƏXXÜS** [*ər.*] *is.* 1. Lovğalıq, təkəbbür; özünü çəkmə, iddia satma. [Nökər] *ancaq təşəxxüs üçün, kim bilsin, hansı yaralının köhnə paltarını geyinibdir.* S.M.Qənizadə. *Ancaq gənclik təşəxxüsü, lovğalıq* [Polada] *mane olur.* Ə.Vəliyev. □ **Təşəxxüs etmək** – lovğalanmaq. [Aşıq Vəli:] *Qohum-əqrəbasına, yalı artanda, təşəxxüs edənə lənət!* N.Vəzirov.

2. **Təşəxxüslə** şəklində *zərf* – lovğalanaraq, lovğalıqla, lovğalana-lovğalana, lovğa-lovğa. *Xülasə, çox təşəxxüslə bəy paşpurtunu verdim mehmanxana nökərinə apardı.* Ə.Haqverdiyev. *Məni görən kimi yerindən qalxdı; Hərif təşəxxüslə baxdı, nə baxdı!* S.Vurğun.

◊ **Təşəxxüs satmaq** – lovğalanmaq, təşəxxüslənmək. *İndi qələmnən təşəxxüs satmaq vaxtı deyil!* C.Məmmədquluzadə. [Əhməd] *..əgər Nabat xala təşəxxüs satıb, çox iddia edərsə, nişanlısından da əl çəkə bilməsini mümkün görürdü.* B.Talıblı.

**TƏŞƏXXÜSLƏNMƏ** "Təşəxxüslənmək"-dən *f.is.*

**TƏŞƏXXÜSLƏNMƏK** *f.* Lovğalanmaq, təşəxxüs etmək, təkəbbürlənmək.

**TƏŞƏXXÜSLÜ** *sif.* 1. Lovğa, təkəbbürlü, mütəkəbbir. *Fərəc bəy atası kimi forslu, təşəx-*

*xüslü, paxıl, dargöz bir adam imiş.* Ə.Vəliyev. [Eyvaz:] *Qonağın üzündə isə ciddi və doğrusunu deyim ki, bir az da təşəxxüslü bir ifadə var idi.* İ.Əfəndiyev.

2. Hörmətli, hörmət doğuran. *Baxıb görürəm ki, bəylik bir təşəxxüslü şeydir, mən də dinməz-söyləməz adımın axırına götürürəm, bir "bəy" qondarıram.* C.Məmmədquluzadə.

**TƏŞƏXXÜSLÜK** *is.* Lovğalıq, mütəkəbbirlik, təkəbbür. [Atasının] *əli aşağı düşməyindən* [Nurəddin] *bir o qədər qəm çəkmirdi, çünki onun təbiətində təkəbbürlük, təşəxxüslük əsla yox idi.* S.S.Axundov.

**TƏŞƏKKÜL** *is.* [*ər.*] İnkişaf prosesində müəyyən xüsusiyyət və şəkil alma, müəyyən bir şəklə girmə; formalaşma. *Azərbaycan dilinin təşəkkülü.* ☐ **Təşəkkül etmək (tapmaq)** – formalaşmaq.

**TƏŞƏKKÜR** *is.* [*ər.*] Edilən yaxşılığa, göstərilən diqqətə görə razılıq, minnətdarlıq. *Ata Gülyazın əlini tutub təşəkkürünü bildirmək üçün sıxdı.* Q.İlkin. *Aydın təşəkkür dolu nəzərlə qıza baxdı.* H.Seyidbəyli. // Bu hissi ifadə edən, minnətdarlıq bildirən (söz, məktub və s.). *Təşəkkür məktubu. – Adam bunları Abbasqulu ağaya söylərkən bu cür mühüm bir xəbərdarlıq üçün ondan təşəkkür gözləmir.* Ə.Sadıq. ☐ **Təşəkkür etmək** – təşəkkür ifadə edən sözlər söyləmək, öz razılığını, minnətdarlığını bildirmək; minnətdarlıq etmək. *Bayram yalnız təşəkkür eləmirdi. Bayram and içirdi.* M.Hüseyn. // Birisinin zəhmətinə verilən rəsmi müsbət qiymət. *Əmrlə təşəkkür elan etmək.*

**TƏŞƏKKÜRNAMƏ** *is.* [*ər.* təşəkkür və *fars.* ...namə] Təşəkkür yazılmış rəsmi sənəd, təşəkkür bildirən kağız, yazı. [Yazgül Fərəcə:] *Mən gənc təbiətçiyəm, yetişdirdiyim bu çiyələk növü üçün .. təşəkkürnamə almışam.* Ə.Məmmədxanlı.

**TƏŞƏR** *sif.* Nadinc. *Təşər uşaq.*

**TƏŞHİR** *is.* [*ər.*] Şöhrətləndirmə, xalq arasında yayma.

**TƏŞXİS** *is.* [*ər.*] 1. Tanıma, tanınma.

2. Təyin etmə.

**TƏŞKİL** *is.* [*ər.*] 1. Düzəldilmə, təsis olunma, əsası qoyulma; düzəltmə, təsis etmə, əsasını qoyma. *Yeni nazirliyin təşkili.* ☐ **Təşkil etmək** – 1) düzəltmək, təsis etmək, əsasını qoymaq, yaratmaq. *İdman cəmiyyəti təşkil etmək. Yeni şöbə təşkil etmək*; 2) qaydaya salmaq, planlı surətdə həyata keçirmək. *Əməyi elmi əsaslarla təşkil etmək. – Rüstəm kənd təsərrüfatını yeni qayda ilə təşkil etmək işini bugünkü məruzədən öyrənmiş olduğundan dedikcə məmnun idi.* T.Ş.Simurq; 3) əmələ gətirmək, meydana gətirmək, ibarət olmaq.

2. Bir şeyin quruluşu. *Sexin təşkilində dəyişiklik etmək.*

**TƏŞKİLAT** *is.* [*ər.* "təşkil" söz. cəmi] İctimai birləşmə və ya dövlət idarəsi. *Birləşmiş Millətlər Təşkilatı. Ticarət təşkilatları.* – [Eyvaz:] *Qərarı heç bir təşkilat çıxarmamışdır.* C.Cabbarlı. *Rüstəm kişi rayonun rəhbər təşkilatları ilə mübahisə etməyi lazım bilmədi.* M.İbrahimov.

**TƏŞKİLATÇI** *is.* Bir şeyi təşkil edən, təşəbbüsçü olan adam. *Ekspedisiyanın təşkilatçısı. – Jurnalın təşəbbüskarı, təşkilatçı və redaktoru C.Məmmədquluzadə "Molla Nəsrəddin" imzası ilə müntəzəm surətdə felyetonlar, baş məqalələr dərc edirdi.* M.İbrahimov. // Təşkilatçılıq qabiliyyəti olan adam. *İstedadlı təşkilatçı. O çox yaxşı təşkilatçıdır.*

**TƏŞKİLATÇILIQ** *is.* Təşkilatçı bacarığı, təşkil etmə bacarığı. [H.Ərəblinskinin] *böyük aktyorluq, rejissorluq, təşkilatçılıq istedadı vardı.* S.Rəhman. // Təşkil etmə. *Təşkilatçılıq işi. Təşkilatçılıq fəaliyyəti.*

**TƏŞKİLEDİCİ** *is.* Təşkil edən, düzəldən, təşkilatçı. *İdman yarışlarının təşkiledicisi.*

**TƏŞNƏ** *is.* və *sif.* [*fars.*] *klas.* 1. Susamış, susuzluqdan yanan, susuz. *Bir təşnə qaynayan bulaq görüncə; İtirər özünü mənim də könlüm.* M.Müşfiq.

2. *məc.* Bir şeyin çox həvəskarı olan (adam); bir şeyin həsrətini çəkən (adam). *Əsrlər uzunu elm və ürfana yaxın buraxılmayan qadınlar təşnə adam kimi susuzluqlarını söndürməyə nail olmuşlardı.* T.Ş.Simurq. *Az bir zamanda yüz minlərlə insanların milli azadlıq hərəkatına qoşulması.. azadlıq idealının təşnəsi olduğunu meydana çıxartdı.* M.İbrahimov.

**TƏŞRİF** *is.* [*ər.*] Öz gəlişi ilə bir şəxsi və ya yeri şərəfləndirmə; gəlmə, gəliş, buyurub gəlmə. *Rövşən et xanəmizi bir gecə təşrifinlə.* S.Ə.Şirvani. ☐ **Təşrif aparmaq** – getmək (hörmət və nəzakət məqamında işlənir).

*Xülasə, axırda övrət təşrif aparır*. C.Məmmədquluzadə. [Hacı Murad:] *Bu gün-sabah* [İmanqulu] *təşrif aparacaqdır*. S.S.Axundov. **Təşrif gətirmək (etmək, buyurmaq)** – gəlmək, buyurmaq (hörmət və nəzakət məqamında işlənir). *Səfalar gətirib, təşrif buyurdun; Qədəm basdın bizə, qurban olduğum*. M.P.Vaqif. [Əmrulla:] *Yeri, bircə o Gülbadam xanıma de ki, özək komisyonu gözləyir, zəhmət çəkib təşrif gətirsin*. C.Cabbarlı. **Təşrif qılmaq** – b a x **təşrif gətirmək**. [Abbas:] *Başına döndüyüm, ay Əsmər xanım; Təşrif qılıb sən bu bağa xoş gəldin!* "Abbas və Gülgəz".

**TƏŞRİFAT** *is*. [*ər*. "təşrif" söz. cəmi] Təntənəli mərasimlər zamanı rəsmən qəbul edilmiş üsul və qaydaların məcmusu, habelə bu mərasimin özü.

**TƏŞRİH** *is*. [*ər*.] 1. Bədəni müəyyən üsulla kəsib əməliyyat aparma (operasiya).

2. *köhn*. Şərhetmə.

**TƏŞT** b a x **teşt**. [İncə:] *Neyləyirəm qızıl təşti ki içinə qan qusuram*. C.Cabbarlı. *Səmədin nəzərləri .. sacın içində qurumuş xəmirdə, barmaq izləri görünən təştin və oxlovun üzərində gəzdi*. İ.Hüseyn.

**TƏŞVİQ** *is*. [*ər*.]: **təşviq etmək** – bir işi görmək üçün dilə tutmaq, həvəsləndirmək, şirnikləndirmək, şövqə, qeyrətə gətirmək, həvəs və arzusunu artırmaq. *Atası da Hüseyni hər zaman rus dilini öyrənməyə təşviq edirdi*. S.Rəhman.

**TƏŞVİQAT** *is*. [*ər*. "təşviq" söz. cəmi] Geniş xalq kütlələrinə siyasi nüfuz göstərmək məqsədi güdən şifahi və ya yazılı fəaliyyət. *Siyasi təşviqat. Təbliğat və təşviqat*.

**TƏŞVİQATÇI** *is*. Təşviqatla məşğul olan, təşviqat aparan adam (b a x **təşviqat**). *Siyasi təşviqatçı. Təşviqatçıların seminarı*.

**TƏŞVİŞ** *is*. [*ər*.] 1. Bir-birinə əks hisslərin mübarizəsindən doğan narahatlıq; təlaş, həyəcan. [Bayram:] *Ancaq elə ondan ötrü təşvişdəyəm, ağa, .. bir sevgilim var*. M.F.Axundzadə. *Ovçu təşviş içərisində gənc həkimə baxdı*. H.Seyidbəyli. □ **Təşviş etmək (keçirmək), təşvişə düşmək** – narahat olmaq, təlaşa düşmək, həyəcanlanmaq. [Almaz:] *Ay ana, sən elə nahaq yerə belə təşvişə düşürsən*. C.Cabbarlı. *Mənzil alanların bu qədər təşviş keçirmələrinin əsas iki səbəbi vardı..* B.Bayramov. **Təşvişə salmaq** – narahat etmək, təlaşa salmaq, həyəcanlandırmaq. *Getmişdi on günə, çıxdı on beşə; Neçin saldı məni belə təşvişə?* Ə.Cavad.

2. **Təşvişlə** şəklində *zərf* – narahatlıqla, həyəcanla, təlaşla. *Yoxsullar soyuq və sərt Bakı qışını təşvişlə qarşılayırdılar*. A.Şaiq. *Seymur əlini* [Teymurun] *sağ əlinə toxundurub təşvişlə soruşdu..* H.Seyidbəyli.

**TƏŞVİŞLİ** *sif*. Təşviş keçirən, narahat, həyəcanlı; təşviş, təlaş ifadə edən. *Təşvişli baxış. – Bəs buruq? – deyə, səhiyyə nazirinin bu sözlərdən sonra təşvişli səsi eşidildi*. S.Rəhimov. *Gənc qadın təşvişli nəzərlərlə fotoqrafa baxdı*. S.Vəliyev.

**TƏTBİQ** *is*. [*ər*.] Həyata keçirmə, icra etmə, işə salma, felə keçirmə. *Elmi nailiyyətlərin istehsalata tətbiqi. Mütərəqqi iş üsullarının tətbiqi. – ..Qulu planlarının tətbiqi üçün var qüvvəsini sərf edir..* Çəmənzəminli. □ **Tətbiq etmək** – həyata keçirmək, felə keçirmək, işlətmək. [Mirzəyev] *kursda oxuduqlarını, öyrəndiklərini öz işinə tətbiq edir, planın artıqlamasilə yerinə yetirilməsində qazandığı bilikdən istifadə edirdi*. Ə.Sadıq.

**TƏTBİQİ** *sif*. [*ər*.] Sırf praktiki əhəmiyyəti olan, praktikada tətbiq olunan. *Tətbiqi elmlər. Tətbiqi biliklər*.

□ **Tətbiqi sənət (incəsənət)** – sənətin elə sahəsinə deyilir ki, onun istehsal etdiyi məişət şeyləri eyni zamanda bədii əsər hesab olunur.

**TƏTƏBBÖ** *is*. [*ər*.] 1. Tədqiq etmə, araşdırma.

2. Mütaliə, mütaliə etmək.

3. Ardınca, arxasınca getmək.

**TƏTİK** *is*. Odlu silahların atəş açmaq üçün barmaqla geri çəkilən manivelası. *Avtomatın tətiyi. Tüfəngin tətiyi. – Ancaq tüfəng çox uzun və ağır olduğundan* [Yaşarın] *əli tətiyə zorla çatdı*. M.Hüseyn. *O cani tətiyi çəkmişdi, bəli; Güllə açılmışdı... o dəyməliydi*. N.Xəzri.

**TƏTİL** *is*. [*ər*.] 1. İşin kütləvi və mütəşəkkil surətdə dayandırılması. *Aprelin iyirmi doqquzunda başlanan xırda tətillər iyulun ikisindən ümumi tətil şəklini aldı*. M.S.Ordubadi. *Fəhlələrin bir həftə əvvəl başlanmış tətili hələ də davam edirdi*. M.Hüseyn.

2. Şagirdlərin istirahəti üçün təhsil müəssisələrində, təhsildə fasilə. *Məktəblərdə yay tətili. Şagirdlər tətildədirlər. – Məktəb tətillərinə az qalmışdı.* H.Seyidbəyli.

**TƏTİLÇİ** *is.* Tətildə iştirak edən adam (b a x **tətil** 1-ci mənada). *Tətilçilərdən bir çoxu öldürülüb, 800 nəfər də sürgün olunmuşdur.* M.S.Ordubadi.

**TƏVAZÖ** *is.* [*ər.*] Öz üstünlüklərini, məziyyətlərini gözə çarpdırmağı, öz xidmətləri ilə qürrələnməyi sevməmə, şöhrətpərəstlikdən, lovğalıqdan uzaq olma; sadəlik. *Yunis mexanikə baxıb ürəyində deyirdi: – Dostum, indi təvazö göstərərsən.* Mir Cəlal.

**TƏVAZÖKAR** *sif.* [*ər.* təvazö və *fars.* ...kar] b a x **təvazölü**. *Təvazökar adam. Təvazökar alim. – Bütün mülahizələrdən Firidun belə nəticəyə gəldi ki, Şəmsiyyə xanımla gələcək əlaqələrində mümkün qədər təvazökar* (z.) *dolanmalıdır.* M.İbrahimov.

**TƏVAZÖKARCASINA** *zərf* Təvazökarlıqla, təvazökarlıq göstərərək. *Təvazökarcasına cavab vermək.*

**TƏVAZÖKARLIQ** *is.* Təvazökar adamın xasiyyəti; sadəlik, təvazö.

**TƏVAZÖLÜ** *sif.* Öz üstünlüyünü, məziyyətlərini gözə çarpdırmağı, öz xidmətləri ilə qürrələnməyi sevməyən, şöhrətpərəstlikdən, lovğalıqdan uzaq olan; özünü sadə aparan. *Təvazölü adam.*

**TƏVƏCCÖH** *is.* [*ər.*] Rəğbət (göstərmə), gülər üz (göstərmə), yaxınlıq hiss etmə (birinə). *Camaatın təvəccöhü yavaş-yavaş mollalardan dönür.* Ə.Haqverdiyev. ☐ **Təvəccöh etmək** *klas.* – nəzər salmaq, diqqət vermək, fikir vermək. [Yusif Sərrac:] *Təəccüb edirəm bu dövlətə ki, ..paytaxtının rövnəqinə təvəccöh etmir.* M.F.Axundzadə. **Təvəccöhünü qazanmaq** – rəğbətini qazanmaq, meylini, məhəbbətini oyatmaq.

**TƏVƏKKÜL** *is.* [*ər.*] *din.* Hər şeyi Allaha buraxma, ondan kömək və imdad gözləmə, taleyə bel bağlama. *Usta Zeynal üçün yaşayışın mənası bir təvəkküldən ibarətdir*. M.İbrahimov.

**TƏVƏKKÜLÜ** *zərf* [*ər.*] Bəxtəbəxt, müvəffəqiyyətinə ümid edərək, riskə gedərək.

**TƏVƏQQE** *is.* [*ər.*] Xahiş, dilək. *Sizdən təvəqqem budur ki...* – [İskəndərbəyov:] *Sizdən bir təvəqqem vardır*. H.Nəzərli. *Atasının təvəqqesinə görə Arzu qız öz yazdığı* “*Günəşin tülusu*” *əsərini zərif barmaqları ilə pianoda dilə gətirdi.* S.Rəhimov. ☐ **Təvəqqe etmək** – xahiş etmək. [Xədicə:] *Səndən* [Nazlıdan] *təvəqqe edirəm ki, bu gün necə olsa Yusifə deyəsən, mənim yanıma gəlsin*. N.Nərimanov. *Bir axşam yığıncaqda Cəfərquludan təvəqqe etdilər ki, o da durub danışsın.* Qantəmir.

**TƏVƏQQEÇİ** *is.* Bir şey xahiş etmək üçün birinin yanına gələn şəxs.

**TƏVƏLLÜD** *is.* [*ər.*] Doğulma, anadan olma, dünyaya gəlmə, doğum. *Hacı Nəsir .. oğlunun təvəllüdünü şadlıq edib, şəhərin fəqir-füqərasına pul və xörək payladı.* S.S.Axundov. *Təvəllüd tarixi heç bir yerdə qeyd edilmiş olmadığından* [Rüstəmin] *yaşını doğru bilən yox idi*. T.Ş.Simurq. ☐ **Təvəllüd şəhadətnaməsi (kağızı)** – doğum kağızı, təvəllüdnamə. *Realni məktəbin birinci sinfinə 11-12 yaşından yuxarı şagirdlər qəbul edilməyirdi, buna görə də yaş göstərən təvəllüd şəhadətnaməsi tələb olunurdu*. T.Ş.Simurq.

**TƏVƏLLÜDNAMƏ** *is.* [*ər.* təvəllüd və *fars.* ...namə] *köhn.* Bir şəxsin anadan olma vaxtını və yerini təsdiq edən rəsmi sənəd; təvəllüd (yaş) şəhadətnaməsi (kağızı). *..Bir neçə gün bundan əqdəm şirvanlı Həsən bəy Əzizbəyov gedib Məhəmməd Ağanın yanına ki, öz oğluna təvəllüdnamə yazdırsın*. “Mol. Nəsr.”

**TƏYİN** *is.* [*ər.*] 1. Müəyyən etmə, aydınlaşdırma. *Zeynal şaşırdı. Nə* [edəcəyini] *təyindən aciz kimi idi.* S.Hüseyn. ☐ **Təyin etmək (eləmək)** – 1) müəyyən etmək, müəyyənləşdirmək, aydınlaşdırmaq, qərarlaşdırmaq. *İndi Minayəyə hər şey aydındı, Mahmud onunla görüş təyin edirdi.* M.Hüseyn; 2) hər hansı bir vəzifəyə, işə qoymaq, müəyyən iş, vəzifə tapşırmaq. *İdarəmizə yeni müdir təyin etdilər. – Mühəndis Sultanov isə cavan oğlanın dülgərlik məharətini görərək* [Fərmanı] *dülgər təyin etdi*. Ə.Sadıq.

2. *qram*. Cümlədə isimlə ifadə olunan üzvlərin əlamətini; (necəliyini) bildirən və “necə”, “nə cür”, “hansı” suallarından birinə cavab olan ikincidərəcəli cümlə üzvü.

◊ **Təyini-müqəddərat** – öz müqəddəratını özü təyin etmə, özü istədiyi kimi həll etmə.

**TƏYİNAT** *is.* [*ər.* "təyin" söz. cəmi] Kurs, məktəb və s. qurtarmış mütəxəssisləri müəyyən yerlərə işə təyin etmə, göndərmə.

**TƏYİNEDİCİ** *sif.* Bir şeyin əsasını təşkil edən, şərtləndirən.

**TƏYİNNAMƏ** *is.* [*ər.* təyin və *fars.* ...namə] Bir işə, vəzifəyə, yerə təyin olunmaq haqqında sənəd. *Səriyyə gəlib çıxmadısa da, Salam gözləmədi. Təyinnaməsini alıb yeni iş yerinə yola düşdü.* Mir Cəlal. [Fəridə:] *Siz yığışıb gedin, ana, mən təyinnaməmi alıb işə başlayacağam.* Ə.Məmmədxanlı.

**TƏYYARƏ** *is.* [*ər.*] Mühərriki və hərəkət etməyən qanadları olan havadan ağır uçucu aparat. *Reaktiv təyyarə. Sərnişin təyyarəsi. Dördmotorlu təyyarə. Hərbi təyyarə. – Kərim göyə tərəf boylanır, buludlarda dolanan təyyarələrə baxırdı.* S.Rəhimov.

**TƏYYARƏÇİ** *is.* Təyyarə sürücüsü; pilot.

**TƏYYARƏÇİLİK** *is.* 1. Təyyarəçinin işi, sənəti, təyyarə sürücülüyü; pilotluq. *Əşrəf təyyarəçilik oxuyan yoldaşlarından ikisini yanına salıb evlərinə gətirdi.* Mir Cəlal.

2. Təyyarə sürməyin nəzəriyyə və praktikası; aeronaviqasiya. *Təyyarəçilik nəzəriyyəsi.*

**TƏYYARƏQAYIRAN** *sif.* Təyyarə qayırmaqla məşğul olan. *Təyyarəqayıran zavod.*

**TƏYYARƏQAYIRMA** *is.* Təyyarə istehsalı ilə məşğul olma, təyyarə qayırma sahəsinə aid olma. *Təyyarəqayırma sənayesi.*

**TƏYYARƏVURAN** *sif.*: **təyyarəvuran top** *hərb.* – mərmi ilə düşmən təyyarəsini vurmaq üçün xüsusi top.

**TƏZAD** *is.* [*ər.*] 1. Ziddiyyət, əkslik. *Vaxtilə bir-birini anlamamış iki aləm bütün təzadı ilə qarşı-qarşıya gəldi.* Çəmənzəminli. *Tehran qabarıq bir təzad içərisində öz adi həyatını yaşayırdı.* M.İbrahimov.

2. *ədəb. inc.* Müəyyən bir fikir və hissi daha qabarıq, canlı və təsirli göstərmək üçün bir-birinə zidd olan həyat lövhələrinin yanaşı verilməsi.

**TƏZADLI** *sif.* Ziddiyyətli, əks, bir-birinə əks olan; bir-birini inkar edən. *Təzadlı düşüncələrlə* [Firidun] .. *yaxınlaşdı.* M.İbrahimov.

**TƏZAHÜR** *is.* [*ər.*] Üzə çıxma, zahir olma, özünü göstərmə, özünü büruzə vermə; ifadə, təcəssüm. [Vaqif:] *İnsan təbiətinin də son təzahürü sevgidir.* Çəmənzəminli. ☐ **Təzahür etmək** – üzə çıxmaq, zahir olmaq, özünü büruzə vermək, özünü göstərmək. ..*Siyasi xadimlərin mətanət və iradəsi daha bariz şəkildə təzahür edər.* M.İbrahimov.

**TƏZƏ** *sif.* [*fars.*] Yeni. *Aptekdən təzə dərman gətirmişdilər.* C.Məmmədquluzadə. [Gülyaz:] *Kəndimizə xəbər yayılıb ki, Bakıdan gələn var, Turşsu barəsində özləri də təzə sözlərdən danışacaqlar.* S.Rəhimov.

**TƏZƏBƏY** *is.* Yenicə evlənmiş, təzəcə ailə qurmuş oğlan.

**TƏZƏBİNƏ** *sif. dan.* Özünə yenicə ailə düzəltmiş, ev tikmiş, ev-eşik düzəltmiş, təzə yerdə yaşamağa başlamış. *Təzəbinə ailə. – Biz, necə deyərlər, təzəbinəyik, yoldaşlar! Sizdən ummağa haqqımız var!* Mir Cəlal.

**TƏZƏCƏ** 1. *sif.* Təzə, təptəzə. *Təzəcə paltar. Təzəcə şey.*

2. *zərf* Yenicə, lap yaxında. *Xiyar təzəcə çıxmışdır. Evə təzəcə gəlmişdim ki... – Samirə orta məktəbi bitirəndə on yeddi yaşına təzəcə girmişdi.* M.Hüseyn. *Gördü, otlar təzəcə baş qaldırıb cücərir; İlk bahar dağ-dərəyə yam-yaşıl xalça sərir.* B.Vahabzadə.

**TƏZƏDƏN** *zərf* Yenidən, bir daha, yenə. *Təzədən başlamaq. Təzədən işə girişmək. Sözü təzədən təkrar etmək.* – [Gülüş:] *Mənə qalırsa, lap evi dibindən söküb yerə qoymaq və təzədən tikmək lazımdır.* C.Cabbarlı. ..*Ana, oğul, gəlin və nəvə təzədən və həmişəlik birləşdilər.* H.Seyidbəyli.

**TƏZƏGƏLİN** *is.* Yenicə ərə getmiş, təzəcə ailə qurmuş qız. *Belə ki təzəgəlin üstü-başı cırıq, üzü saralmış, zavallı bir şəklə girən qulluqçuya dönərdi.* H.Sarabski.

**TƏZƏK** *is.* Qurudulduqdan sonra yanacaq kimi işlədilən qaramal peyini. *Qara damlar adda-budda salınmışdı, dal tərəflərində təzək qalaqlanmışdı.* Çəmənzəminli. *Sacın altına qalanmış təzək tüstüləyirdi.* Ə.Vəliyev.

**TƏZƏLƏMƏ** "Təzələmək"dən *f.is.*

**TƏZƏLƏMƏK** b a x **yeniləmək**. *Xudayar bəy katda olan kimi lap dəyişildi. Paltarını təzələyib, xəbər verdi ki, onun adı Xudayar deyil, Xudayar bəydi.* C.Məmmədquluzadə. *Həyatdakı siyasi, ictimai və iqtisadi dəyişikliklər Mirzağanın əski ruhunu təzələyə bilməmişdi.* S.Hüseyn.

**TƏZƏLƏNMƏ** "Təzələnmək"dən *f.is.*

**TƏZƏLƏNMƏK** bax **yenilənmək**. [Şair:] *Təzə arzularım, təzə sözlərim; Bu gün ürəyimdə təzələnibdir*. N.Xəzri.

**TƏZƏLƏŞDİRMƏ** "Təzələşdirmək"dən *f.is.*

**TƏZƏLƏŞDİRMƏK** bax **yeniləşdirmək**.

**TƏZƏLƏŞMƏ** "Təzələşmək"dən *f.is.*

**TƏZƏLƏŞMƏK** bax **yeniləşmək**.

**TƏZƏLİK** bax **yenilik**. *..Bildim ki, dostum burada yenə bir təzəlik yaratmaq istəyir.* Qantəmir.

**TƏZƏLİKCƏ** bax **təzəcə** 2-ci mənada.

**TƏZƏNƏ** *is.* Mizrab (saz).

**TƏZİM** *is.* [*ər.*] Baş əyərək salam vermə; baş endirmə. □ **Təzim etmək** – 1) baş əyərək salam vermək, baş endirmək. *Elçi şaha təzim edib, çıxıb getdi*. (Nağıl). *Vaqiflə Mirzə Əliməmməd xalqa təzim edə-edə yuxarı başa keçib, göstərilən yerdə əyləşdilər*. Çəmənzəminli; 2) *hərb.* farağat vəziyyətində sağ əlinin barmaqlarını birləşdirib gicgahına aparmaqla əsgəri salam vermək. *Növbətçi təzim edərək uzaqlaşdı*. M.Hüseyn. [Midhət] *qan-tərə bata-bata aerodroma gəldi. Komandana təzim elədi*. Ə.Vəliyev.

**TƏZİYƏ** bax **yas** 1-ci mənada. *Atasının dəfn və təziyəsi Nurəddinə yuxu kimi gəlirdi*. S.S.Axundov. *Bəlkə Züleyxanın başı ərinin təziyəsinə qarışdığı üçün bu işin dalına düşən olmadı*. Ə.Vəliyev. □ **Təziyə saxlamaq** – bax **yas saxlamaq** ("**yas**"da). *El adətilə üç gün .. təziyə saxlayıb, üçüncü gün Əkbəri gətirib, atasının dükanını açıb əyləşdirdilər*. Ə.Haqverdiyev. [Şahnisə xanım Vaqifə:] *Kərim xana, deyəsən, təziyə saxlamaq istəyirsiniz?* Çəmənzəminli.

**TƏZİYƏDAR** *sif.* [*ər.* təziyə və *fars.* ...dar] *köhn.* Yaslı, təziyəli. [Kazım Vaqifə:] *Demə bu şəhərdə adamı ölənin papağına palçıq sürtərmişlər ki, təziyədar olduğu bilinsin.* Çəmənzəminli.

**TƏZİYƏLİ** bax **yaslı** 1-ci mənada.

**TƏZKİRƏ** *is.* [*ər.*] Görkəmli şəxsiyyətlərin, xüsusən şair, rəssam və b.-nın həyatı haqqında qeydlər və əsərlərindən nümunələr verilən əsər. *Lütfəli bəy Azər Beqdelinin* "*Atəşgədə*" *təzkirəsi.*

**TƏZKİRƏÇİ** *is.* Təzkirə yazan adam, təzkirə müəllifi.

**TƏZMƏK** *f. məh.* Hürkmək, hürküb qaçmaq.

**TƏZMİNAT** *is.* [*ər.* "təzmin" söz cəmi] Məğlub dövlətin qalib dövlətə verməli olduğu pul; kontribusiya. // Düşmənin işğal etdiyi ərazinin əhalisindən aldığı pul, ərzaq və s.

**TƏZVİC** *is.* [*ər.*] Ərə vermə.

**TƏZVİR** *is.* [*ər.*] 1. Saxtalaşdırma.

2. *köhn.* Hiyləbazlıq.

**TƏZYİQ** *is.* [*ər.*] 1. Öz ağırlığı ilə basma, sıxma; basqı. *Qarın təzyiqi altında budaqlar sındı*. // Qazların və mayelərin elastiklik dərəcəsi. *Buxarın təzyiqi. Atmosfer təzyiqi.*

2. Zorakı təsir, məcbur etmə; basqı. *Zəif inkişaf etmiş dövlətlərə iqtisadi təzyiq.*

**TƏZYİN** *is.* [*ər.*] Bəzək-düzək vermə, bəzəndirmə.

**TFU** *təql.* 1. Tüpürərkən çıxarılan səs. *Əcnəbi .. tfu deyərək, gözlərini ovuşdurmağa başladı.* S.M.Qənizadə.

2. Danışanın bir şeyə və ya şəxsə qarşı nifrətini və ya bir şeydən və ya şəxsdən əsəbiləşdiyini, hiddətləndiyini ifadə etmək üçün işlədilir. *Tfu sənə! Tfu, bu nə biabırçılıqdır!* – [Qurban:] *Tfu sizin kimi insafsız adamlara!* A.Şaiq.

**TIĞ** *is.* Böyük qalaq, yığın. *Kərbəlayı Hatəmxan əlindəki kürəyi buğda tığına vurub, ağa dərvişə tərəf yeridi.* S.Rəhimov. *Dağ ətəklərində isə hələ də soyuqlar davam edir, quzeylərdəki qar tığları gömgöy göyərirdi.* B.Bayramov. □ **Tığ vurmaq** – qalaq vurmaq, qalaqlamaq, tay vurmaq. *Yusif gülə-gülə izah elədi: – Qardan indi çoxlu yığıb tığ vuracağıq.* B.Bayramov.

**TIĞLAMA** "Tığlamaq"dan *f.is.*

**TIĞLAMAQ** *dan.* Tığ vurmaq, qalaqlamaq. *Samanı tığlamaq. Buğdanı tığlamaq*.

**TIĞLANMIŞ** *f.is.* Tığ vurulmuş, qalaqlanmış. *Budur ..tayalarla dolu xırman, sovuruq, tığlanmış kəhrəba buğda!* Mir Cəlal.

**TIX** *is.* 1. Ucu iti balıq sümüyü. *Balığın ətini tıxından ayırmaq*.

2. İtiuclu tilişkə, tikan və s. *Əlimə tıx batıb.*

**TIXAC** *is.* 1. Şüşə və s. bu kimi boğazlı qabların ağzını və ya müxtəlif cihazların deşiklərini qapamaq üçün dairəvi mantar və ya başqa şey; probka. [Musa kişi:] *parçadan tikilmiş və nazik iplə kuzənin qulpuna*

*bağlanmış tıxacı açdı.* M.İbrahimov. *Tıxac sıçrayıb qapıya dəydi, konyak yerə çiləndi.* İ.Hüseynov.

2. *məc.* Normal hərəkətə, axına mane olan şeylərin toplusu; probka. *Maşınlardan küçədə tıxac əmələ gəlmişdi.*

3. Neft quyularında borunun içinə yığılan və nasosun normal işləməsinə mane olan parafin və s. qatı. *Borunu dəyişmək lazımdır, – deyə qoca usta, nəhayət qamətini düzəltdi: – Yoxsa yenə tıxac bağlayacaq.* Y.Əzimzadə. *Çıxmalıdır quyudan; Tıxac tutmuş borular.* Ə.Əlibəyli.

**TIXACÇIXARDAN** *is.* Şüşənin tıxacını çıxarmaq üçün yivli oxu və dəstəsi olan alət; probkaaçan. *Bu zorba bıçağın üç-dörd tiyəsi, qayçısı, dırnaqtutanı, konservaçanı, vintburanı, tıxacçıxardanı vardı.* M.Hüseyn.

**TIXACLAMA** "Tıxaclamaq"dan *f.is.*

**TIXACLAMAQ** *f.* Tıxac tıxamaq, şüşə və s.-nin ağzını tıxacla bağlamaq; probkalamaq.

**TIXACLI** *sif.* Ağzı tıxacla bağlanmış, tıxacı olan; probkalı. *Ağzı tıxaclı litrlik şüşəni pəncərə qabağına qoydu.* Mir Cəlal.

**TIXAMA** "Tıxamaq"dan *f.is.*

**TIXAMAQ** *f.* 1. Güclə sığışdırmaq, yerləşdirmək; soxmaq, dürtmək. *Serdyuk.. əsgini* [Təvəkkülün] *ağzına tıxadı..* Ə.Əbülhəsən. // Dəliyi, deşiyi, bir şeyin aralarını əsgi və s. şeylə tutmaq, qapamaq. [Niyaz] bir gün səhərdən-axşama kimi tövlə qapısının bütün işıq gələn yerlərinə köhnə və cır-cındır tıxadı. Ə.Vəliyev.

2. Yolunu kəsmək, qapamaq. [Şamilin] *nəfəsini ağır bir şey tıxamış, gözləri dumanlanmışdı.* A.Şaiq.

◊ **Qulağına pambıq tıxamaq** – b a x **qulaq**.

**TIXANMA** "Tıxanmaq"dan *f.is.*

**TIXANMAQ** 1. *məch.* Nəfəs ala bilməmək, nəfəsi kəsilmək, nəfəsi tutulmaq. [Qurban:] *Aşağıya getmək çox çətindir, neftin qoxusundan nəfəs tıxanır.* A.Şaiq. *Ağayar boğazı tıxanmış kimi susdu.* Ə.Əbülhəsən.

2. *f.* Yapışan, özlü, qəliz, qatı bir şeyin içinə batmaq. [Atakişi:] *Bir yerdə xırtdəyədək tıxandıq* [palçığa]. C.Cabbarlı.

3. *f.* Dar, darısqal bir yerdə yerləşmək. *Qonaqlar Səfərin xatiri üçün bu dar, çubuq otağa tıxanıb qalmışdılar.* Çəmənzəminli. [Nofəl atlılara:] *Orada düşmənin sağ cinahı tar-mar oldu. Siz isə qoyun kimi bura tıxanıbsınız!* Ə.Məmmədxanlı.

**TIXILI** *sif.* Güclə basılmış, güclə yerləşdirilmiş. *Yun tıxılı kisə.*

**TIXILMA** "Tıxılmaq"dan *f.is.*

**TIXILMAQ** *məch.* Güclə yerləşdirilmək, soxulmaq, basılmaq, keçirilmək, soxuşdurulmaq. *Paltarlar çamadana tıxıldı.*

**TIXIMA** "Tıxımaq"dan *f.is.*

**TIXIMAQ** b a x **tıxamaq**. *Yorğan-döşəyi məfrəşə tıxımaq.*

**TIXIŞDIRMA** "Tıxışdırmaq"dan *f.is.*

**TIXIŞDIRMAQ** b a x **tıxımaq**.

**TIXLANMA** "Tıxlanmaq"dan *f.is.*

**TIXLANMAQ** *f.* Balaca balıqlarda tıx əmələ gəlmək.

**TIXLI** *sif.* Tıxı olan. *Tıxlı balıq.*

**TIXMA** "Tıxmaq"dan *f.is.*

**TIXMAQ** *f. dan.* (Acgözlüklə) yemək. *Getdim, o arsıza deyim ki, gəlsin; Tıxsın zəhrimardan, qarnı kökəlsin.* H.K.Sanılı. [Veys:] *Biz işləmişik bu vaxta kimi* [dövlətlilər] *tıxıblar, qoy indi onlar işləsinlər, biz yeyək!* Ə.Əbülhəsən.

**TIXNAŞDIRMA** "Tıxnaşdırmaq"dan *f.is.*

**TIXNAŞDIRMAQ** *f. dan.* 1. Zorla tıxımaq, soxmaq, soxuşdurmaq.

2. B a x **tıxmaq**.

**TIXNAŞMA** "Tıxnaşmaq"dan *f.is.*

**TIXNAŞMAQ** *qarş.* Güclə bir yerə girmək, soxulmaq, soxuluşmaq, sıxışmaq (çoxları haqqında). *Arxadan çapıb gələn dəstə atların cilovunu çəkib, dar keçidə tıxnaşır.* Ə.Məmmədxanlı.

**TIXSIZ** *sif.* Tıxı olmayan.

◊ **Tıxsız balıq** *məc.* – heç kəslə işi olmayan, heç kəsə nə yaxşılığı, nə də pisliyi keçən adam haqqında. *Tıxsız balığın biridir.*

**TIQQ** *təql.* Yuxarıdan düşən və ya bir şeyə dəyən bərk bir şeyin çıxardığı səs (bəzən təkrar edilərək işlədilir).

**TIQQILDAMA** "Tıqqıldamaq"dan *f.is.*

**TIQQILDAMAQ** *f.* Tıqq (tıq-tıq) səsi çıxarmaq, tıq-tıq eləmək. *Küləkdən qapı tıqqıldadı.*

**TIQQILDATMA** "Tıqqıldatmaq"dan *f.is.*

**TIQQILDATMAQ** *f.* Yavaşca taqqıldatmaq, tıq-tıq etmək. *Çingiz gülüş vəziyyətindəki*

*simasını ciddiləşdirərək masanı tıqqıldatdı..* Çəmənzəminli. *Koridorda qapı ağzında dayanan Rüxsarə şəhadət barmağını qatlayaraq üç dəfə qapını tıqqıldatdı*. S.Rəhimov.

**TIQQILTI** *is.* Tıqq (tıq-tıq) səsi. *Sayad Pəri tıqqıltı eşidib qarabaşı Ağcaqızı dürtmələdi.* "Əmrah". *A kişi, bilmirəm gecənin nə vaxtı idi, yuxuda qulağıma bir tıqqıltı gəldi*. C.Məmmədquluzadə.

**TIQ-TIQ** 1. Bax **tıqq**.

2. *Zərf mənasında.* Tıq-tıq edərək, tıqqıldaya-tıqqıldaya. *Saat küncdə tıq-tıq ötür; Dəqiqələr keçib gedir.* M.Dilbazi.

**TINCIXMA** "Tıncıxmaq"dan *f.is.*

**TINCIXMAQ** *f. məh*. Çətinliklə nəfəs almaq, nəfəsi təng olmaq. *Qızdırmadan tıncıxmaq. – İstidən ürəkləri tıncıxanlar* (f.sif.) *da divarlara dalbadal tüpürüb canlarını rahat edirdilər*. Çəmənzəminli. [Əsgərin] *nəfəsi tıncıxdı, artıq dayana bilməyib, Kosa ilə danışmağa girişmək qərarına gəldi*. S.Rəhimov.

**TIN-TIN** *sif.* və *zərf* Bəzi səsləri burunda deməkdən ibarət tələffüz tərzi, burnunda danışma. *Tın-tın danışmaq. – Mən də dedim, amma indi sözə qulaq asan hanı? – deyə tın-tın Qaytaran burnunda cavab verirdi.* S.Rəhimov.

**TIPPILDAMA** "Tıppıldamaq"dan *f.is.*

**TIPPILDAMAQ** *f.* Tıppıltı (tıp-tıp) səsi çıxarmaq. // Tıp-tıp etmək, döyünmək, çırpınmaq (ürək haqqında). *Bağ yiyəsinin qorxusundan ürəyi tıppıldayan* (f.sif.) *xam bülbül belə oxuyar*. "M.N.lətif."

**TIPPILTI** *is.* Tıpp (tıp-tıp) səsi. *Tıppıltı eşitmək.*

**TIP-TIP** 1. *təql.* bax **tıppıltı**.

2. *zərf* Tıppıltı ilə. ☐ **Ürəyi tıp-tıp döyünmək** – qorxudan, həyəcandan, sevincdən və s. səbəbdən ürəyi bərk döyünmək, çırpınmaq. [Telli:] [Gəlini] *otağa aparıb gərdək dalında oturdurlar, ürəyin tıp-tıp döyünə-döyünə gözləyirsən.* Ü.Hacıbəyov.

**TIRILDAMA** "Tırıldamaq"dan *f.is.*

**TIRILDAMAQ** *f.* Tırıltı səsi çıxarmaq. *Motor tırıldadı.*

**TIRILTI** *is.* Tır-tır səsi. *Həyatdə eşidilən motor tırıltısı Qoşqarın əzablı düşüncələrini yarıda qırdı*. İ.Hüseynov.

**TIRTIL** *is.* 1. *zool.* Bir neçə cütayaqlı qurdabənzər bədəni olan kəpənək sürfəsi. *Kəpənək tırtılı.*

2. Yoldakı maneələri keçmə qabiliyyətini artırmaq üçün maşında, traktorda, tankda, ekskavatorda və s.-də təkəri əvəz edən enli zəncir. *Ekskavatorun* (*traktorun*) *tırtılı.*

**TIRTILLI** *sif.* Tırtılı olan, tırtılla hərəkət edən. *Tırtıllı traktor.*

**TISBAĞA** *is. zool.* Bədəni sümük qınla örtülü, qısa ayaqları ilə çox yavaş hərəkət edən, ayaqlarını və başını qının içində gizlədən sürünən heyvan. *Quru tısbağası. Dəniz tısbağası. Bataqlıq tısbağası. – Bir ilan, bir dəvə, bir də tısbağa; Yoldaş olmuşdular bunlar sabiqa*. Q.Zakir. *Birdən maralın sağ tərəfindən, bulanıq sular arasından bir tısbağa başını çıxarıb onu salamladı*. M.Hüseyn.

◊ **Tısbağa kimi** – çox yavaş, çox ağır. *Parovoz tısbağa kimi ağır-ağır gedirdi*. M.S.Ordubadi. **Tısbağa kimi başını qınına çəkmək** – 1) ictimai işlərdən kənara çəkilib öz xüsusi işləri ilə məşğul olmaq; 2) öz evində oturub heç bir yerə getməmək, evdən bayıra çıxmamaq. *Camaatı talamağa adət etmiş xainlər tısbağa kimi başını qınına çəkib dışarı çıxmağa cürət etmirdi*(*lər*). M.S.Ordubadi. **Tısbağa qınından çıxıb, (öz) qınını bəyənmir** – böyüyüb, boya-başa çatdığı ailəni, mühiti, kollektivi, yeri bəyənməyən adam haqqında. [İmran kişi:] *Bəlkə tısbağa qınından çıxıb, qınını bəyənmir, hə?* M.Hüseyn. **Tısbağa sürəti (yerişi, gedişi)** – çox yavaş, çox kiçik sürət, çox ağır yeriş. *Tısbağa sürəti ilə getmək*. – [Rüstəm kişi:] *Tısbağa yerişi ilə gedən bir kolxozu iki-üç ilə o hündürlüyə qalxızmaq qeyri-mümkündür*. M.İbrahimov.

**TISILDAMA** "Tısıldamaq"dan *f.is.*

**TISILDAMAQ** *f.* Çox yeməkdən nəfəsi çətinləşərək fışıltılı səs çıxarmaq. *Qarı yaz öküzü kimi o qədər yemişdi ki, tıs-tıs tısıldayırdı.* (Nağıl).

**TISMAQ** *f.* İncimək, küsmək, narazı qalmaq.

**TİAMİN** *is.* $B_1$ vitamini.

**TİBB** *is.* [*ər.*] 1. Xəstəliklər, onların müalicəsi və qarşısını almaq haqqındakı elmlərin məcmusu. *Aynadan beş-altı yaş böyük olan*

*qardaşı tibb institutunda dosent idi*. İ.Əfəndiyev. □ **Tibb bacısı (qardaşı)** – müalicə müəssisələrində orta təhsilli tibb işçisi.

2. B a x **səhiyyə**. *Tibb işçiləri həmkarlar ittifaqı*. – [Sevinc Qaçaya:] *Durmayın, tez tibb məntəqəsinə aparın*. Z.Xəlil.

**TİBBİ** *sif.* [*ər.*] Tiblə, təbabətlə, müalicə işi ilə əlaqədar olan, təbabətə aid olan. *Tibbi yardım. Tibbi müayinə. – Rüxsarə bəzən şəhərə getmək, işə düzəlmək, sonra da ali tibbi təhsil almaq qərarına gəlirdi*. S.Rəhimov. // Təbabətdə işlədilən, müalicə əhəmiyyəti olan. *Tibbi yağlar. – Tibbi sabunlar yağ turşularının metal duzlarından ibarətdir*. R.Əliyev.

**TİCARƏT** *is.* [*ər.*] Mal alıb-satma, geniş miqyasda alver, alğı-satqı. *Xarici ticarət. Xüsusi ticarət. Ticarət əlaqəsi*. – [Həmzənin] *böyük planları vardı, ticarətini Tiflis və Batum təriqi ilə İstanbula, oradan da o yana yeritmək istəyirdi*. Ə.Əbülhəsən.

**TİCARƏTÇİ** *is.* Tacir. *Nemətullayev illər uzunu bir mahir ticarətçi kimi bu işlə yaşardı*. S.Rəhimov.

**TİCARƏTXANA** *is.* [*ər.* ticarət və *fars.* ...xanə] Ticarət evi, ticarət müəssisəsi, ticarət kontoru. *Türküstanda* [Sərdarovun] *ticarəti, hər şəhərdə mülkü, karvansarası, ticarətxanasının şöbələri var idi*. Ə.Haqverdiyev. [Yaşlı kişi:] *Hacı Ramazan adlı bir tacirin ticarətxanasında ayda otuz manat maaşla qulluq edirdim*. S.Hüseyn.

**TİFAQ** *is.* [*ər.*] 1. Ailə ocağı, dudman, yurd. *Ə.Haqverdiyevin* “*Dağılan tifaq*” *draması*. – [Yaşlı kişi:] *Bizim əvvəlki illərdəki tifaqımızdan bir əsər qalmayıb, tamamilə dağılmışdı*. S.Hüseyn. □ **Tifaqı dağılmaq** – asudə, firavan həyatı pozulmaq, dudmanı dağılmaq. [Surxay:] *O kimdi elə tifaqı dağılan?* S.Rəhman. **Tifaqın dağılsın!** – qarğış məqamında işlədilir.

**TİFİL** *is.* [*ər.*] Uşaq. [Kazım Allahquluya:] *..Başını aşağı sal, kəsbkarlığına qurşan, bu tifilləri saxla*. Çəmənzəminli. *Çox analar bu iki tifilin tərbiyəsinə həsrət çəkirdilər*. S.S.Axundov. // *məc.* Aciz, yazıq, zavallı. [Salman bəy:] *Bəs o biçarə tifillər necə olacaqlar?* N.Vəzirov. [Qoca Bayrama:] *O qız xeylağıdır, günahı varmı? Tifil bir insanı vurmaq olarmı?* M.Müşfiq.

**TİFİLCİYƏZ** *oxş*. Yazıq, fağır, aciz (uşaq). [Böyükxanım Ağacavada:] *Tifilciyəzimi o məktəbə qoya bilmərəm ki, Baləlinin uşaqları gündə təpəsinə döysünlər..* B.Bayramov.

**TİFİLLİK** *is.* Uşaqlıq.

**TİFTİK** *is.* 1. Qoyunun, keçinin, dəvənin baharda qırxılan zərif və yumşaq yunu. *Yunu, tükü və tiftiyi qoyundan, keçidən, dəvədən, atdan, inəkdən və s. heyvanlardan alırlar*. “Əmtəəşünaslıq”. // Həmin yundan toxunmuş. *Camal əmi səliqə ilə .. üç cüt yun, bir cüt tiftik əlcək, beş cüt yun corab, bir yun başlıq, dörd dənə əl dəsmalı yeşiyə qabladı*. Ə.Vəliyev. *Sol tərəfdəki ağ, bəzəkli uşaq* [çarpayısının] *toru cırıldadı, üstündəki tiftik adyal tərpəndi*. Mir Cəlal.

2. Əl silmək üçün ip, lif topası. *Əziz çəkici gətirdi və əllərini ucu cibindən bayıra çıxıb sallanmış yumşaq, çirkli tiftiklə sildi*. Q.İlkin.

**TİFTİKLƏNMƏ** “Tiftiklənmək”dən *f.is.*

**TİFTİKLƏNMƏK** *f.* İplikləri, telləri bir-birindən ayrılmaq, sökülmək, tiftik-tiftik olmaq, didilmək. *Bu parça çox tez tiftiklənir*. – *Süni ipək təbii ipəyə nisbətən qaba, çox parlaq, qoxulu, tez tiftiklənən* (f.is.) *və davamsız olur, ancaq ucuz qiymətlidir*. “Əmtəəşünaslıq”.

**TİFTİKLİ** *sif.* Tiftiyi olan, xovlu. [Nəriman] *tiftikli ağ məhrəba ilə bərk-bərk qurulandıqdan sonra stulda əyləşdi*. İ.Əfəndiyev.

**TİĞ** *is.* [*fars.*] 1. *klas.* Qılınc. // Obrazlı təşbehlərdə. *Qəmzə tiğin çəkdi, çaldı canımı; Bir cəllada döndü, aldı canımı*. M.P.Vaqif. *Çək tiğini, gər var isə günahım; Öldür, gərdən mənim, ixtiyar sənin*. Q.Zakir.

**TİK** [*holl.* tyk, *ing.* tick] Döşəküzü, çexol və s. tikmək üçün işlədilən miləmil qalın parça.

**TİKAN** *is.* 1. Dəvətikanının, qızılgülün və bəzi başqa bitkilərin iynə kimi itiuclu hissəsi. *Ayağına tikan batmaq. Nar ağacının tikanı. – Evi süpürəndə süpürgənin tikanı.. düşüb fərşin üstünə və batıb qonağın yumşaq yerinə*. C.Məmmədquluzadə. // Tikanlı kol, dəvətikanı. *Çəpərlərdən çıxan tikan kolları oynaya-oynaya gəlib yol çuxurlarında bənd alır*. Mir Cəlal. *Bu yerin on-on iki addımlığında*

*iri bir tikan tayası var idi*. M.Rzaquluzadə. // Bir şeyin iti ucu, batan tərəfi. *Məftilin tikanı.*

2. Bəzi heyvanların bədənini örtən iynələrdən hər biri. *Kirpinin tikanı.*

3. B a x **tıx**. *Balığın tikanı.*

◊ **Tikan olub gözünə batmaq** – görmək istəmədiyi, zəhləsi getdiyi bir şey, ya adam daima gözü qabağında olmaq. [Ələmdar:] *Ancaq düzü, bu Nikolay poqonları mənim gözümə tikan olub batır, bəy!* S.Rəhimov. **Tikan üstündə oturan kimi** – çox narahat halda, nigarançılıq içində, iztirab çəkə-çəkə. **Tikan üstündə oturmaq** – çox narahat olmaq, nigarançılıq çəkmək, iztirab içində olmaq. **(Ürəyindən) tikan çıxarmaq** – qisasını almaq, əvəzini çıxmaq, ürəyini soyutmaq. [Şirəli:] *Sağ ol, bala! Hamımızın ürəyindən tikan çıxartmısan*. S.Rəhman.

**TİKANCIQ** *is.* 1. Balaca tikan, kiçik tikan. *Qızılgülün tikancığı. Əlinə tikancıq batmaq*.

2. Balaca tıx, nazik tıx. *Siyənək balığının tikancığı.*

**TİKANÇI** *is.* Keçmişdə: tikan qırıb satmaqla məşğul olan adam. *Biri vardı, biri yoxdu, bir tikançı vardı.* (Nağıl).

**TİKANLI** *sif.* 1. Tikanı olan (b a x **tikan** 1-ci mənada). *Tikanlı bitkilər. – Alağa – qərənfil, yovşana – reyhan; Tikanlı qanqala – gül desəm olmaz.* Aşıq Şəmşir. *Aydın tikanlı kollar arasından çıxıb, sinədolusu rahat nəfəs aldı.* H.Seyidbəyli.

2. Üzərində tikanlar olan. [Şeyda Fəridəyə:] *İndi bizim bağla sizin bağ arasında tikanlı məftildən qara bir çəpər var.* Ə.Məmmədxanlı.

3. *məc.* Qəlbə, ürəyə toxunan; acı, ağır, zəhərli, qaba, kobud. *Lakin Rüstəm kişi* [Şirzadın] *gözlərində bu sözləri oxumadı; orada yalnız tikanlı bir ifadə gördü..* M.İbrahimov.

4. Tıxlı. *Tikanlı balıq.*

**TİKANLIQ** *is.* 1. Çoxlu tikan kolları bitmiş yer, tikan kolluğu. *Qaraatlılar da özlərini tikanlığa vurdular*. "Koroğlu". *Nəbi tikanlıqda gedirmiş kimi yavaş-yavaş ağacın üstü ilə yeriməyə başladı*. Ə.Abasov.

2. Yandırmaq və ya başqa məqsəd üçün yerdən çıxarılmış tikanın saxlandığı yer. *Tikanlıqdan tikan götürmək.*

**TİKANSIZ** *sif.* Tikanı olmayan. [Orxan:] *Bəllidir ki, olmaz tikansız qönçə*. H.Cavid.

◊ **Tikansız balıq** – heç bir kəsi özündən incitmək, heç bir kəsə nə pislik, nə də yaxşılıq etmək istəməyən adam haqqında. *Tikansız balığın biridir.*

**TİKANYARPAQ(LI)** *sif.* Yarpaqları tikan kimi, itiuclu olan. *Tikanyarpaqlı otlar.*

**TİKDİRMƏ¹** "Tikdirmək¹"dən *f.is.*

**TİKDİRMƏ²** "Tikdirmək²"dən *f.is.*

**TİKDİRMƏK¹** *icb.* Başqasına bina və s. tikmə işi gördürmək. *Ev tikdirmək.* – [Sara bibi:] *Rəhmətlik öz sağlığında tikdirdiyi tövlədir*. Qantəmir. [Nəriman:] *Əşi, o boyda mədəniyyət sarayı tikdirmişik, qalıb ağzıbağlı..* İ.Əfəndiyev.

**TİKDİRMƏK²** *icb.* Sifarişlə birinə paltar və s. tikmə işi gördürmək. *Özünə palto tikdirmək.* – [Mirzağa] *toy üçün özünə yenicə tikdirdiyi paltarını geymiş, özünün görünüşünü Cəmilənin xoşuna gələcək bir şəklə salmışdı.* S.Hüseyn. *Veys kiçik bacısına qanovuzdan tuman, al faydan kofta tikdirmişdi*. Ə.Əbülhəsən.

**TİKƏ** *is.* 1. Böyük bir şeydən sınmış, qopmuş, ayrılmış və ya kəsilmiş kiçik hissə, parça, qırıq. [Rövşən] *salam-əleykəssalamdan sonra daşın bir balaca tikəsini ustaya verib dedi..* "Koroğlu". // Yeyilən şeyin bir hissəsi. *Pendir tikəsi*. – [Musa kişi:] *Arvad, sən allah, yadından çıxmasın, bu ətdən bir tikə də o Həsənəlinin yetimlərinə göndər, yazıqdırlar..* M.İbrahimov. // *məc.* Yaşamaq üçün vəsait; yeyəcək, yeyiləcək şeylər. *Tikəsini dostu ilə bölmək. – Düşmənin tikəsindən dostun şilləsi yaxşıdır*. (Ata. sözü). *İnsan gərək dayanıbdurmasın, yatıb vaxtını, gününü öldürməsin, çıxan tüstü, hazır tikə axtarmasın.* S.Rəhimov.

2. "Bir" sözü ilə – **bir tikə** – 1) bir az, bir zərrə, bir qırıq, zərrə qədər, qətiyyən, əsla. *Bacardıqca vermə yer beynində artıq yükə; Mənə bax, ay qız, mənə, dərd çəkmirəm bir tikə.* S.Rüstəm. *Havada bir tikə də bulud, duman və tüstü yox idi*. M.İbrahimov; 2) balaca, kiçik, bambalaca. *Bir tikə uşaq.*

◊ **Tikə boğazından getmək** – həyəcandan, yorğunluqdan, hirsdən və s. hisslərdən dolayı heç nə yeyə bilməmək. **Haram tikə** – b a x **haram**. **Ürəyi bir tikə olmaq** – b a x **ürək**. **Yağlı tikə** – b a x **yağlı** 3-cü mənada.

**TİKƏ-PARÇA** b a x **tikə-tikə**. ☐ **Tikə-parça eləmək** – tikə-tikə eləmək, əzib tökmək. *Küçələrdə ildırım kimi çaxıyan avtomobillər axır vaxtlarda başlayıblar uşaqları əzib tikə-parça eləməyə*. C.Məmmədquluzadə.

**TİKƏ-TİKƏ** *zərf* Parça-parça, doğram-doğram, tikə-parça. *Kağızı tikə-tikə etmək*. – [Pəri Cadu:] *İtil gözümün qabağından. Bir də səni görsəm, tikə-tikə elərəm*. Ə.Haqverdiyev. [Sultan bəy:] *Öldürəcəyəm! Bu papaq mənə haram olsun ki, bir də arşınmalçı adı tutsan, tikə-tikə doğrayacağam*. Ü.Hacıbəyov.

**TİKİLİ**[1] *is.* Bina, tikinti; tikilmiş ev, bina və s. *Daş tikili* (*daşdan tikilmiş bina, ev və s.*). – [Şəhər] *gözəl bir səhranın ortasında idi, yaxşı başıqübbəli məscidi, böyük karvansarası, müsafirxanası və qeyri tikililəri var idi*. E.Sultanov. *Maşının keçdiyi yerlərdə, onun arxasınca, uçurulan evlərin yerində indiki tikililərə bənzəməyən evlər tikilir*. S.Hüseyn.

**TİKİLİ**[2] *sif.* Tikilmiş. *Tikili paltar. Qoyun dərisindən tikili kürk.*

**TİKİLİŞ**[1] *is.* Tikilmə, inşaat, tikinti; tikmə işi. *Məktəbin tikilişi. – İşçilər yığılıb, hökumət sarayı tikili-şinə baxmağa getdilər*. Mir Cəlal.

**TİKİLİŞ**[2] *is.* Paltar və s. tikmə; tikmə işi, tikmə tərzi; tikim. *Paltarın tikilişi.*

**TİKİLMƏK**[1] "Tikmək[1]"dən *məch. Boş yerlərdə indi çoxlu ev tikilmişdir. – Qoyuldu özüllər, boylandı tağlar; Tikildi divarlar, şumal dirəklər*. M.Müşfiq. *Mədəniyyət evi kəndin cənub qurtaracağında tikilmişdi*. İ.Əfəndiyev.

**TİKİLMƏK**[2] "Tikmək[2]"dən *məch. Paltar yaxşı tikilmişdir. Şalvar çox enli tikilib*. – [Tahirin] *pencəyi təzə dəbdə, uzun və gen tikilmişdi*. M.Hüseyn.

**TİKİM** b a x **tikiliş**[2]. *Paltonun tikimi.*

**TİKİNTİ** *is.* 1. Bina, tikili. *Möhtəşəm tikintilər; Qurulur ölkəmizdə*. M.Seyidzadə.

2. Tikmə, inşaat. *Nümayəndə heyəti əvvəlcə tikinti işləri ilə maraqlandı*. Ə.Vəliyev.

3. Tikinti işi aparılan yer, inşaat meydançası. *Salman kişi axşam tikintiyə qayıdanda briqada üzvlərini orada gördü*. Mir Cəlal.

**TİKİRTGƏ** b a x **kanifol**. *Baxşı cəld durur ayağa, kamançanı alır, çəkilib oturur dizi üstə, cibindən tikirtgə çıxarıb kamanı çəkir tikirtgəyə*.. C.Məmmədquluzadə.

**TİKİŞ** *is.* 1. Tikmək işi, tikmə, tikim. *Tikiş dərnəyi. Tikiş maşını*. – [Gülnisə:] *Bu saat duraram, ana, tikişimin bir azca yeri qalıb, onu qoy qurtarım*. Ə.Haqverdiyev. ☐ **Tikiş tikmək** – iynə-saplayan tikiş maşınında bir şey tikməklə, tikişlə məşğul olmaq. *Hacı Mehdinin ikinci övrəti Güllü oturub tikiş tikir*.. Ə.Haqverdiyev. *Pinəçi Qafar başmaq yamarkən oxuyur, Şahsənəm də tikiş tikir*. S.S.Axundov.

2. Tikilmiş parça, dəri və s. parçalarının birləşdiyi yer. *Köynəyin tikişi. Tikişi sökülmək.*

3. Bir şeyin hissələrinin bitişdiyi, calaşdığı, bənd olduğu yer, bitişmə yeri. *Borunun tikişi*. // *tex.* Eyni mənada detallar, qurğular və s. haqqında. *Qaynaq edilmiş metalın tikişi*. // *tib.* Cərrahiyyə əməliyyatında toxumaların tikilib bitişdirildiyi yer. *Yaranın tikişi sökülüb*. // Bu cür tikiş nəticəsində dəridə əmələ gələn qırış; qırışıq. *Üzündə yara tikişi var.*

◊ **Tikiş qoymaq** – yaranın kənarlarını birləşdirib xüsusi materialla tikmək. **Tikişi açmaq** – tikilmiş yara sağaldıqdan sonra onun saplarını açmaq, çıxarmaq.

**TİKİŞÇİ** *is.* Tikiş sənayesi işçisi; dərzi. *Tikişçilərin bayramqabağı əmək nailiyyətləri*. // Sif. mənasında.

**TİKİŞLİ** *sif.* 1. Tikişləri olan, bitişik, bənd edilmiş yerləri olan, bütöv olmayan. *Tikişli boru.*

2. Qırış, qırışıq (cərrahiyyə əməliyyatı nəticəsində). *O vaxtdan Qəhrəmanın üzü tikişli qalmışdı*. Ə.Vəliyev.

**TİKİŞSİZ** *sif.* Tikişi, tikiş yeri olmayan, bütöv hazırlanmış. *Tikişsiz boru.*

**TİKMƏ**[1] "Tikmək[1]"dən *f.is.*

**TİKMƏ**[2] "Tikmək[2]"dən *f.is.*

2. *is.* Parça üzərində rəngbərəng saplarla müxtəlif naxışlar salmaqdan ibarət xalq sənəti, habelə belə məmulatın özü. *Qarşı divara yekə bir tikmə vurulmuşdu*. B.Bayramov.

**TİKMƏÇİ** *is.* Tikmə ustası (B a x **tikmə**[2] 2-ci mənada).

**TİKMƏK**[1] *f.* 1. Daşdan, kərpicdən, taxtadan və s.-dən bina, divar və s. ucaltmaq, qurmaq. *Ev tikmək. Məktəb tikmək. Divar tikmək*. – [Atası Rövşənə:] *İndi sən gərək böyük bir tövlə tikəsən*. "Koroğlu".

2. Düzəltmək, qurmaq, hazırlamaq (yuva). *Tikəndə quş yuva, çör-çöp; Yığıban, zir-zibil istər.* Q.Zakir. *Tikan üstə qonan quşlar; Qonmaz bura, tikməz yuva!* Z.Xəlil.

3. Təyin etmək, qoymaq. *Sonra camaat Qaraqaşı tikdi padşah.* (Nağıl). [Xan:] *Mən* [İsanı] *Dızaq sığnağına yüzbaşı tikdim, daha demədim ki, başıma bəla olsun..* Çəmənzəminli.

**TİKMƏK²** *f.* 1. Tikmə işi görmək, tikişlə məşğul olmaq. *Tikiş maşınında tikmək. İynə ilə tikmək.*

2. Parçanın, dərinin və s.-nin kənarlarını iynə-sapla bir-birinə calayaraq paltar, ayaqqabı və s. hazırlamaq. *Kostyum tikmək. Ayaqqabı tikmək. – Yusif Sərrac ... oturub, əlində bir cilovu tikib tamam edirdi..* M.F.Axundzadə. *Mən körpəykən özü biçib, özü tikmiş paltarımı; Gülüşündə görmüşəm öz çiçəklənən baharımı.* S.Rüstəm.

3. Parça və s. üzərində rəngbərəng saplarla həndəsi və ya nəbati naxışlar, şəkillər toxumaq. *Təkəlduz tikmək.*

4. Cərrahiyyə əməliyyatında: toxumaları iynə-sapla birləşdirmək, bitişdirmək. *Şərəfoğlunun qarnını yarmış, bağırsağını kəsib tikmişdilər.* M.İbrahimov.

◊ **Gözünü tikmək** – b a x **gözünü dikmək** (“**göz**”də).

**TİKMƏLİ** *sif.* Tikməsi olan, tikmə tikilmiş, tikmə naxışlı, tikmə ilə bəzədilmiş (b a x **tikmə**² 2-ci mənada). *Tikməli yaylıq.*

**TİLAVƏT** *is.* [*ər.*] Quranı avazla oxumaq.

**TİLİŞKƏ** *is.* Taxtanın iynə kimi iti uclu kiçik hissəsi. *Rüxsarə yaxına gəlib* [Kosanın] *əlinə diqqətlə baxdı. Onun ovcunun içi doğrudan da qaralmışdı, orada odun tilişkəsi var idi.* S.Rəhimov.

**TİL(L)** *is.* 1. Kənar, qıraq. *Yolun tili. – İndi Şamo gah cığırla.. və gah da cığırın tili ilə gedirdi.* S.Rəhimov.

2. Əlin çeçələ barmaqdan ovuca tərəf olan hissəsi. [Yusif] *..gah ülgücü əlinin tilinə çəkib itiləyir, gah da qabağına qoyduğu dəyirmi güzgünün yerini rahatlayırdı.* B.Bayramov.

3. Uzunsov təpənin üstü. *Təpənin tili. – Atlar tildən üzüaşağı addım-addım enirdilər.* S.Rəhimov.

4. İki səthin kəsişdiyi yer. *Piramidanın tili.*

**TİLL** b a x **qalaq**. *Bəzi Para xırmanlarda döyülən taxıllar xüsusi yığanlarla toplanır və qabaq tərəfdə till vurulurdu.* S.Rəhimov.

**TİLLƏMƏ** “Tilləmək”dən *f.is.*

**TİLLƏMƏK** b a x **qalaqlamaq**.

**TİLOV** *is.* Balıq tutmaq üçün ucu iti çəngəl; qarmaq. [İmamverdi Nurəddinə:] *Sənə tilov qayıracağam, hər gün çayda balıq tutarsan.* S.S.Axundov. ☐ **Tilov atmaq** – balıq tutmaq üçün tilovu suya salmaq.

**TİLSİM** *is.* [*ər.*] Mövhumatçılara görə, sehrli qüvvəyə malik söz və s.; ovsun, sehr (ən çox nağıllarda işlənir). *İbrahim bir tilsim oxuyub, oldu tülkü, çıxıb kolun dibindən, yapışdı dəbrüşün boğazından, boğub öldürdü.* (Nağıl). *Bir tilsim oxuyub, oğlan oldu həminki Qaraqaş, özü də yıxılıb yatdı.* (Nağıl). ☐ **Tilsim etmək** – b a x **tilsimləmək**. **Tilsimə düşmək** – 1) b a x **tilsimlənmək**. [Gülzar Bəhruza:] *Düz deyirəm, oğul, sən bu evdə tilsimə düşmüsən.* Ə.Məmmədxanlı. *Amma indi* [Zəhra] *elə bil tilsimə düşmüşdü.* Y.Əzimzadə; 2) *dan.* çətinliyə düşmək, dolaşığa düşmək. *İşi tilsimə düşmək.* **Tilsimə salmaq** – b a x **tilsimləmək**. [Dərviş] *Qaraqaşı görən kimi nə ki tilsimlər vardı, oxudu ki, Qaraqaşı tilsimə salsın.* (Nağıl). [Telli arvad:] *Baxıram bu sədr qızının gözlərinə, elə bilirəm, igidləri tilsimə salan sehr-cadudur.* M.İbrahimov.

**TİLSİMBƏND** *sif.* [*ər.* tilsim və *fars.* bənd] Tilsimlənmiş, tilsimə salınmış, ovsunlanmış, ovsunlu. *Qəmər vəzir də bilirdi ki, qız tilsimbənddi. Qızı əmisi oğlu ala bilməyəcəkdir.* (Nağıl).

**TİLSİMÇİ** *is.* və *sif.* Nağıllarda: tilsim edən adam; sehrbaz, ovsunçu. *Tilsimçi qoca üzüyü özü üçün götürüb, çatirlə xurcunu Əhməd Mirzəyə verib dedi..* (Nağıl).

**TİLSİMLƏMƏ** “Tilsimləmək”dən *f.is.*

**TİLSİMLƏMƏK** *f.* Tilsim etmək, tilsim oxumaq, tilsimə salmaq, ovsunlamaq.

**TİLSİMLƏNMƏ** “Tilsimlənmək”dən *f.is.*

**TİLSİMLƏNMƏK** *məch.* Tilsim edilmək, tilsimə salınmaq, tilsimə düşmək, ovsunlanmaq.

**TİLSİMLƏNMİŞ** *f.sif.* Tilsimə salınmış, tilsim edilmiş, sehrlənmiş, ovsunlanmış.

**TİLSİMLİ** *sif.* Tilsim edilmiş, tilsimə salınmış, tilsimlənmiş. [Padşah:] *O Qaçaq Nəbi*

*girinizə keçən kimi onun, o güllə batmayan tilsimli Boz atının şəklini də aldırıb mənə göndərin*. S.Rəhimov.

**TİMİK** *is. məh*. Bir şeyin iti çıxıntısı, tini.

**TİMİKLİ** *sif. məh*. İti çıxıntısı, tini olan.

**TİMOL** *is*. [*lat*.] Səciyyəvi iyi olan rəngsiz kristal maddə.

**TİMPAN** *is*. [*yun*.] Qədim zərb musiqi aləti.

**TİMSAH** *is*. [*ər*.] *zool*. Tropik və subtropik ölkələrdə yaşayan qalın və sərt dərili sürünən yırtıcı iri heyvan. *Timsah dərisi*.

**TİMSAL** *is*. [*ər*.] 1. Nümunə, örnək, misal.

2. Məsəl, zərbi-məsəl. *Məşədi Həsən əmi əlavə olaraq.. tat şivəsi ilə bir timsal da söylədi*. S.Hüseyn. [Hacı:] *Nə qədər timsal və zərbi-məsəllər eşitsəniz, uşaqlarınıza deyin, dəftərlərinə yazsınlar*. Qantəmir.

3. *klas*. Şəkil, rəsm, surət, təsvir. *Üçüncü otağın divarlarında İranın sair silsilədən olan padşahlarının timsalı nəqş olunmuşdu*. M.F.Axundzadə.

4. *köhn*. bax **təmsil** 2-ci mənada. *Rusların məşhur ədibi.. Krılov* "*Ağacın yarpaqları və kökləri*" *adlanan bir timsalında yazır*. F.Köçərli.

**TİMSİNMƏ** "Timsinmək"dən *f.is*.

**TİMSİNMƏK** *f. məh*. Tələsmək. [Dərviş:] *..Qoca qarı balasının imdadına çatmaq qəsdi ilə timsindi*. A.Divanbəyoğlu.

**TİN** *is*. 1. Bir şeyin iki xarici tərəfinin birləşdiyi, kəsişdiyi yer. *Şkafın tini*. // İki küçənin kəsişdiyi yer. *Bu anda qarşıdakı tindən bir neçə qaraltı çıxaraq tənha küçə ilə mənə tərəf irəliləməyə başladı*. Ə.Məmmədxanlı. *Maşın tini döndü*. H.Seyidbəyli.

2. Bir şeyin kənarı, qırağı. *Sonra Veys pəncərə tinində oturub dedi..* Ə.Əbülhəsən.

3. Tində olan, tində yerləşən; tindəki. [Həmzə:] *Qurban! Səfəri apar, bu tin dükandan bir kəllə qənd al, ver ona gətirsin, gedək axundun yanına*. C.Cabbarlı.

◊ **O tində-bu tində** – orada-burada, hər yerdə, hər tində. *..Getdikcə evdə də, çöldə də Mayanın ətrafında danışıqlar artırdı, o tində-bu tində Qaraşın qulağına bir söz çatırdı*. M.İbrahimov.

**TİNBAŞI** *is. zərf* Hər tində. *Tinbaşı əl açardı adama dilənçilər*. S.Rüstəm. // *məc*. Hər yerdə, hər addımda. *Hər tinbaşı Hacı Aslan xasiyyət.. adamlar ortaya çıxmışdı*. S.Hüseyn.

**TİNDƏKİ** *sif*. Tində olan, tində yerləşən. [Böyükoğlu:] *Kağızı gətirdim o tindəki aptekə*. Qantəmir.

**TİNƏT** *is*. [*ər*.] *klas*. Xilqət, fitrət, təbiət, yaradılış. [Məhəmməd:] *Qara torpaq olsa da ilk və axır yerimiz; Eşqdir tinətimiz, eşqdir cövhərimiz*. B.Vahabzadə.

**TİNG** *is*. Calaq vasitəsilə yetişdirilən ağac şitili. *Alma tingi*. – *Tikinti rəisi hələ yazda Qubadan və başqa rayonlardan xeyli ağac tingləri gətirib küçələrə əkdirmişdi*. Ə.Sadıq.

**TİNGƏ** bax **tin** 1-ci mənada. [Məşədi Əsgər] *evin tingəsinə gedib əvvəlcə bağçasına baxdı*. S.M.Qənizadə. *Birdən tingə başından qəfildən bir dəstə qız* [Aynanın] *qarşısına çıxdı*. Ə.Məmmədxanlı.

**TİNGLİK** *is*. Ting yetişdirilən sahə, yer. *Şəhərin ətrafında iki park, tingliklər, parniklər yaradılırdı*. Ə.Sadıq.

**TİNKTÚRA** [*lat*.] Spirt və ya efirdən hazırlanmış dərman maddəsi.

**TİNLİ** *sif*. Tini olan; tilli. *İti tinli stol*.

**TİP** [*yun*. tynos – nümunə, forma] 1. Şeylərin, hadisələrin məlum qrupuna uyğun gələn nümunə, model və ya variant; forma, növ. *Sərnişin təyyarəsinin tipləri. Torpaq tipləri. Kazarma tipində ev*.

2. *biol*. Heyvan və bitki sistematikasında: qohum sinifləri birləşdirən bölgü. *Gül bitkilərinin tipi. Buğumayaqlı heyvanlar tipi*.

3. İnsanın etnik mənsubiyyəti ilə bağlı olan səciyyəvi fiziki quruluşu, siması. *Afrikalı tipi. Monqol tipi. Şərq tipi*. // Sifət, xarici görünüş haqqında. *Kəndli tipi. Şofer tipində bir adam*.

4. İctimai, peşə, mənəvi və s. xüsusiyyətləri bir cür olan adamlar kateqoriyası, habelə hər hansı belə bir qrupun bariz nümayəndəsi. *Gənc kəndli tipi*. – *Usta Zeynal tamamilə dolğun, bitkin və parlaq ictimai tipdir*. M.İbrahimov.

5. *ədəb*. və *inc*. Hər hansı bir insan qrupunun səciyyəvi xüsusiyyətlərini özündə birləşdirən bədii surət. *Meşşan tipi. Alim tipi. Komik tip*.

6. *dan*. Adətən qəribə və ya mənfi xasiyyətli adam haqqında. *Qəribə tip. Tipin biridir*.

– [Məhəmməd:] *Kolxozumuzun xeyri üçün gərək belə pozğun tiplərə divan tutanda uf deməyəsən!* M.Hüseyn.

**TİPÁJ** [*fr.* typoge, əsli *yun.* typos] 1. *tex.* Hər hansı məmulat növlərinin, modellərinin məcmusu. *Təyyarələrin tipajı. Traktorların tipajı.*

2. *inc*. Adamların hər hansı ictimai kateqoriyası, tipi üçün səciyyəvi olan əlamətlərinin məcmusu. *İctimai tipaj.*

3. *kino*. Öz səciyyəvi xarici görünüşünə görə hər hansı bir rola, surətə uyğun gələn aktyor.

**TİPİ́K** *sif.* 1. Müəyyən tipə xas olan, müəyyən tipi təmsil edən.

2. Müəyyən xüsusiyyətlərə malik olan; səciyyəvi. *Tipik hadisə.*

3. *ədəb.* və *inc*. Bir sıra adam, hadisə üçün səciyyəvi olan əlamət və xassələri özündə birləşdirən, əks etdirən. [Ü.Hacıbəyov] *ailə həyatını tipik şəraitdə açır..* Ə.Sultanlı.

**TİPİKLƏŞDİRMƏ** "Tipikləşdirmək"dən *f.is.*

**TİPİKLƏŞDİRMƏK** *f.* Tipik etmək, tipik şəklə salmaq.

**TİPİKLİK** *is.* 1. Tipik olma.

2. *ədəb.* və *inc.* Bir çox şəxs və ya hadisə üçün səciyyəvi olan fərdi əlamət və xüsusiyyətlərin bir şəxs və ya hadisədə birləşməsi.

**TİPLƏŞDİRMƏ** "Tipləşdirmək"dən *f.is.*

**TİPLƏŞDİRMƏK** *f.* 1. *xüs.* Müəyyən tipə uyğunlaşdırmaq. *Texnoloji prosesləri tipləşdirmək. Tikinti obyektlərini standartlaşdırmaq və tipləşdirmək.*

2. *ədəb.* və *inc*. Tipik cəhəti seçib konkret bədii surətlərdə, formalarda təcəssüm etdirmək, canlandırmaq.

**TİPÓQRAF** [*yun.*] 1. Mətbəə işi mütəxəssisi, mətbəə işçisi; mətbəəçi.

2. *köhn.* Sətirtökən, mətnyığan maşın növü.

**TİPOQRÁFİYA** [*yun.* typos və grapho] b a x **mətbəə**.

**TİPOLÓGİYA** [*yun.* typos və logos] Şeylərin və ya hadisələrin hər hansı ümumi xüsusiyyətlərinə görə təsnifi.

**TİPOLOJİ́** *sif.* [*yun.*] Şeylərin, hadisələrin hər hansı tipinə aid olan. *Tipoloji fərq. Tipoloji xüsusiyyətlər.* // Şeylərin, hadisələrin əlamətlərinin ümumiliyini müəyyənləşdirməyə əsaslanan. *Dillərin tipoloji təsnifi. Tipoloji tədqiqat.*

**TİR¹** *is.* 1. Kəsilmiş böyük ağacın budaqlardan təmizlənmiş və başı kəsilmiş gövdəsi: şalban, diniş. *Bir vaqon tir. – Məktəbin yanına kərpic və tir yığılmışdı.* Ə.Məmmədxanlı.

2. Ağac və ya dəmir şalban, dirək. *Talvarın tiri. – Ev köhnə evə oxşayırdı, çünki tirlərin çoxusu əyilibdir.* C.Məmmədquluzadə. [Kosa] *üzərinə qoşa tir atılmış çayın üstünə çıxdı.* S.Rəhimov.

**TİR²** [*fars.*] *klas.* b a x **ox²**. *Ətrafım tir, kaman, oxdu; Dəlilər yanımda yoxdu.* "Koroğlu". *Versəydi əgər dəstimə tir ilə kamanın; Seyd olmaz idim, mən dəxi seydəfkən olurdum.* S.Ə.Şirvani.

**TİR³** [*fr.*] Təlim məqsədilə odlu və ya pnevmatik əl silahlarından nişana atmaq üçün xüsusi avadanlıqla təchiz edilmiş yer, bina. *Alt otaqların birində tir düzəltmişdilər.* Ə.Vəliyev.

**TİRÁJ¹** [*fr.*] 1. İstiqraz və ya lotereya uduşlarının oynanması. *Dövlət istiqrazının növbəti tirajı.*

2. İstiqraz vərəqlərinin və ya başqa kağızları buraxan idarə tərəfindən ödənilməsi. *Ödəniş tirajı.*

**Tİ́RAJ²** [*fr.*] Buraxılmış çap nəşrləri nüsxələrinin sayı. *Qəzetlərin tirajı. Bədii əsərlərin böyük tirajla çap edilməsi.*

**TİRAN** *is.* [*yun.*] 1. Qədim Yunanıstanda və XIII-XVI əsrlərdə İtaliyada hakimiyyəti zorla ələ keçirən şəxs.

2. Ölkəni zorakılıqla idarə edən amansız hökmdar.

**TİRANNOZAVR** *is.* Nəhəng yırtıcı dinozavr cinsi.

**TİRBAŞI** *is.* Tirin başından kəsilmiş parça (b a x **tir¹** 1-ci mənada).

**TİRCİK** *is.* Balaca tir.

**TİRÉ** [*fr.*] 1. Uzun üfüqi xətt (–) şəklində durğu işarəsi.

2. Morze əlifbasında belə işarə, habelə həmin işarəyə uyğun səs siqnalı.

**TİREOİDİN** *is.* [*yun.*] Qaramalın qurudulmuş qalxanabənzər vəzisindən alınan dərman preparatı.

**TİRƏ**[1] *is.* 1. Nəsil, tayfa. [Dadaş Lələşov:] *El bilir ki, onların törəməsi ilə bizim tirə əmiuşağı olubdur.* S.Rəhimov.

2. Bir-biri ilə düşmənçilik edən və ya yola getməyən dəstələrdən hər biri. *Naxçıvan əhli, demə, üç tirədir, beş tirədir.* Ə.Qəmküsar. *Əlləri xəncərli və qılınclı qumuqlar iki tirə olub, bir-birinə soxulmaq istəyirdilər.* Çəmənzəminli.

**TİRƏ**[2] *is.* 1. Arx, xəndək və s.-nin kənarlarında tökmə torpaq; azacıq hündür yer, təpəcik, təpəlik, dikdir. *Çayırlı tirə.* // Bölmə, bölüm, blok.

2. Qıraq, kənar. *Pəncərə tirəsində oturduqda* [Həmzənin] *gözü fikirli-fikirli bir kənarda dayanmış Qadirə sataşdı.* Ə.Əbülhəsən.

**TİRƏLƏNMƏ** "Tirələnmək"dən *f.is.*

**TİRƏLƏNMƏK** *f.* Dəstələrə, bloklara ayrılmaq. *Səs-küy qopdu. Xırmançılar tirələnib tərəfbətərəf oldular.* S.Rəhimov.

**TİRLƏNMƏ** "Tirlənmək"dən *f.is.*

**TİRLƏNMƏK** *f.* Tir çəkmək, sərələnmək, uzanmaq. *Bozdar da divarın dibinə tirlənərək dilini çıxarmış, ləhləyirdi.* Ə.Vəliyev. [Arvad:] *Allah, sən saxla, Allah, sən saxla, – deyib, şarpıltı ilə qarın içinə tirləndi.* S.Rəhimov.

**TİRLİ** *sif.* Tiri (tirləri) olan, üstünə tir qoyulmuş, yaxud tir dayağı olan.

**TİRMƏ** *is.* Şərqdə: yun və ya ipəkdən toxunma naxışlı qiymətli şal parça; tirməşal. *5 metr tirmə.* // Həmin parçadan olan. *Balaca nimçələrdə tirmə süfrənin ortasına düzülmüş xuruşlar və yeməklər hamıdan artıq Məşədi Məmmədin diqqətini cəlb edirdi.* B.Talıblı. [Qadın] *tirmə şallı, cavan və yaraşıqlı bir gəlin idi.* Mir Cəlal.

**TİRMƏLİ** *sif.* Tirmədən tikilmiş paltar geymiş və ya şal örtmüş. *Tirməli gəlin lap cavan idi.* Mir Cəlal.

**TİRMƏŞAL** bax **tirmə**. *Bu küçənin tirməşal qurşaq tacirləri ilə boğazı qalstuklu fabrikant və mədənçiləri.. bir müqəddərat daşıyırdılar.* S.Hüseyn.

**TİRTAP** *zərf:* **tirtap düşmək (uzanmaq)** – çox yorğun olduğundan əl və ayaqlarını uzadaraq uzanmaq, bərk yatmaq. [Rizvan] *durub, canın dişinə alıb, özün yetirdi məndəcarlığa. Gördü ki, arvadı Nisə tirtap uzanıbdı.* (Nağıl). *Əleyhqazlarımızı başımızın altına qoyub tirtap düşərdik.* Mir Cəlal.

**TİR-TİR** *zərf:* **tir-tir titrəmək (əsmək)** – soyuqdan, qorxudan, həyəcandan bərk titrəmək, əsim-əsim əsmək. [Ərən:] *Hər kəs Nəbini dəhşətlə dinləyir, qorxudan tir-tir əsirdi.* Çəmənzəminli.

**TİRYƏK** *is.* [*fars.*] Yetişməmiş xaşxaşın qüvvətli narkotik maddə olan qurudulmuş şirəsi (bəzən dərman maddələri istehsalında istifadə olunur). [Xart Tehraniyə:] *Tiryək sizi qurutmuşdur, qoca, hansı aslan ağzına alsa, ürəyi bulanıb geri qaytaracaq.* Ə.Məmmədxanlı.

2. Beyini, ağılı kütləşdirən, həqiqi varlığı düzgün dərk etməyə mane olan şey haqqında. *Din yoxsullar üçün bir tiryəkdir ki, onları qəflətdə saxlayıb oyanmaqlarına mane olmuşdur.* S.S.Axundov.

**TİRYƏKÇİ** bax **tiryəki**. *Burada köhnə tiryəkçilər var, otuz illik stajı olanlar var.* B.Talıblı.

**TİRYƏKXANA** *is.* [*fars.*] Tiryək çəkilən yer. *Abkənarda çayxana olmadığı kimi, tiryəkxana da yox idi.* S.Hüseyn. *Bir kimsə qalmadı tiryəkxanada; Azacıq halına yoxdur yanan da.* M.Müşfiq.

**TİRYƏKİ** *sif.* [*fars.*] Tiryək çəkən adam; tiryəkçi, narkoman. [Qadın:] *Bu mənim oğlumdur, .. tənbəl, biqeyrət, biar və tiryəkinin birisidir.* S.Hüseyn. *Mən cılız və tiryəki bir adamın səsinə oxşar bir səs eşitdim..* M.İbrahimov.

**TİSƏKLƏMƏ** "Tisəkləmək"dən *f.is.*

**TİSƏKLƏMƏK** *f.* Çisəmək, çiskinləmək, narın-narın yağmaq (yağış haqqında). *Bəzən tisəkləyən, bəzən də güclənən bahar yağışı belə* [Tərlangili] *yerlərindən tərpədə bilmədi.* M.Hüseyn.

**TİŞƏ** *is.* [*fars.*] 1. Daş və s. üzərində naxış qazımaq üçün ucuiti alət; qələm.

2. Külüng. [Səfərin] *cavanlıq vaxtında.. ağ sal daşlara vurduğu tişənin ahəngdar səsi gecə də qulağından getməzdi.* Mir Cəlal.

**TİTÁN** [*yun.*] 1. *kim.* Boz-gümüşü rəngli bərk metal-kimyəvi element.

2. Su qaynatmaq üçün xüsusi quruluşlu böyük qab, cihaz.

**TİTANİT** *is.* [*yun.*] Şəffaf növləri yarımqiymətli daş olan mineral.

**TİTƏ** *is.* Bəzi adamların göz bəbəyində olan ağ ləkə.

**TİTƏLİ** *sif.* Titəsi olan, ləkəli. *Titəli göz.*

**TİTR** [*fr.*] 1. Kinolentdə yazı, izahedici və ya danışıq mətni.

2. *kim*. Titrləmə üçün işlədilən məhlulun qatılığı.

3. Toxuculuq sənayesində: ipək sapın və ya lifin qalınlığının çəki vahidləri ilə ifadə olunan xarakteristikası. *Təbii ipək saplarda nömrə əvəzinə titr işlədilir. Titr 45 metr uzunluğunda olan sapın çəkisi deməkdir*. "Əmtəəşünaslıq".

**TİTRƏDİCİ** *sif.* Sarsıdıcı. *Araz çayı körpüsündən İrana keçən ağır topların gurultusu hava gurultusu qədər dəhşətli və titrədici idi.* M.S.Ordubadi.

**TİTRƏK** *sif.* 1. Titrəyən, titrər, əsən. *Arvad zəif, titrək əlilə uşağın başını oxşayıb ovutmağa çalışırdı.* M.İbrahimov. *Nə xoşbəxtəm, bir yerdəyəm öz anamla indi mən; Əllərimi çəkməyirəm onun titrək əlindən*. Z.Xəlil. // Məc. mənada səs haqqında. *O gün sənin titrək laylan yollarıma işıq salır*. Ə.Cavad. *Boğulmasın titrək səsin; Saçlarına dən düşməsin*. S.Vurğun.

2. *məc.* Yanıb-sönən, sayrışan (işıq haqqında). *Yanır qəribanə kənd axşamları; Titrək işıqlarla məscid şamları.* S.Vurğun.

3. Tərpənən, azacıq ləpələnən. *Titrək dəniz. – Elə uçur, qanadlanır ki; Onun tək zərifdir, titrəkdir Göygöl.* N.Xəzri.

**TİTRƏQUŞ** *is. dan.* Soyuğa həssas olan, azacıq soyuqdan titrəməyə başlayan adam. *Titrəquşun biridir*.

**TİTRƏMƏ** "Titrəmək"dən *f.is.* İşığın titrəməsi. *Monometr əqrəbinin titrəməsi*. – [Mələyin] *canı sızıldayır və ağladığı səsinin titrəməsindən anlaşılırdı.* A.Divanbəyoğlu. *İkram, qızın zərif əllərinin titrəməsindən, yas və iztirabla dolu gözlərinin küskün baxışlarından nə isə bir az ehtiyat elədi*. Ə.Əbülhəsən.

**TİTRƏMƏK** *f.* 1. Titrəmə tutmaq, əsmək. *Geyər cırıq bürünməsin, soyuqda titrəyər, əsər; Gedər odunçu meşəyə, ağac qırar, odun kəsər.* A.Səhhət. *Mehriban əsəbiləşdiyindən titrəyən* (f.sif.) *əllərilə kəlağayısını başına doladığı halda* [dedi]. S.Hüseyn. // *məc*. Əsmək. *Qoca kövrək səsinin titrədiyini duyub susdu*. M.Hüseyn.

2. *məc.* Yanıb-sönmək, sayrışmaq, titrək işıq vermək. *O gündən titrədi məscid şamları; Qərib gecələrin Ay işığında.* S.Vurğun.

3. *məc.* İztirab, narahatçılıq keçirmək, narahat olmaq. *Qəhrəmanın öz oğlu üçün nə qədər titrədiyini Firəngiz yaxşı bilirdi.* S.Rəhimov. // Dalğalanmaq, əsmək. Xalqın *ciyərindən dalğalanaraq; Əllərdə titrədi bir qızıl bayraq*. S.Vurğun.

4. *məc.* Hərəkətə gəlmək, təlatümə gəlmək, sarsılmaq. *Dünyalar titrədi, aləmlər mayallaq aşdı, fələklər bir-birinə qarışdı, millətlər yuxudan oyanıb gözlərini açdılar*. C.Məmmədquluzadə. *Göyə lərzə düşür bomba səsindən; Dağlar da titrəyib gəlir baş-başa.* S.Vurğun.

**TİTRƏR** b a x **titrək**. [Dərviş:] *Ruqiyyənin yarpaq kimi titrər əlindən mənim əlimə bir atəş* [keçdi]. A.Divanbəyoğlu.

**TİTRƏŞMƏ** "Titrəşmək"dən *f.is.*

**TİTRƏŞMƏK** *qarş.* Titrəmək (çox adam və ya şey haqqında). *Göyərtədə durmuş adamların rəngbərəng yaylıqları titrəşirdi*. M.Hüseyn. *Səhərdir, titrəşir otlar, tər otlar*. N.Xəzri.

**TİTRƏTMƏ** 1. "Titrətmək"dən *f.is.*

2. B a x **titrətmə-qızdırma**.

**TİTRƏTMƏK** *t-li.* 1. Azacıq o yan-bu yana hərəkət etdirmək, əsdirmək, tərpətmək. ..*Sübhün həzin yeli yaşıl yarpaqları titrədir, ..çiçəklər baş-başa verərək bülbülün yanıqlı nəğməsinə səbəb olurdu*. Çəmənzəminli. [Fəhlə] *gözünü yavaş-yavaş aşağı enən kvadrata dikərək tormozun dəstəyini asta-asta titrədir və qazırdı.* M.İbrahimov. // *məc*. Sarsıtmaq, yerindən tərpətmək. *Hər gün top kimi guruldayan səslər yüksək, başıqarlı, dağları titrədir*. M.İbrahimov. *Bütün gecəni davam edən şiddətli tufan səhərə kimi dağları, dərələri titrətdi.* Ə.Məmmədxanlı.

2. Bədəninə titrətmə, üşütmə düşmək. [Fatma xanım:] *Bu gecə sabaha kimi titrətmişəm*. N.Vəzirov. [Sərvnaz Şahmara:] *Nəcəfalı titrədib, yıxılıb yorğan-döşəyə. Od kimi yanır, heç halı özündə deyil*. B.Bayramov.

3. *məc.* "Ürəyini", "qəlbini", "vücudunu" və s. sözlərlə – həyəcanlandırmaq, həyəcana gətirmək, sarsıtmaq. *Həzin musiqi səsi*

*ürəkləri titrədir. – Barmağını zəngin düyməsinə basdıqda, içəridən* [Mehribanın] *yeknəsəq.. səsi eşidildikdə Zeynalın sanki vücudunu titrətdi*. S.Hüseyn.

**TİTRƏTMƏ-QIZDIRMA** *is*. Titrədib-qızdırma; titrətmə, malyariya.

**TİTRƏTMƏQOVAQ** *is. bot.* bax **əsməqovaq**.

**TİTRƏTMƏLİ** *sif.* 1. Titrətmə (malyariya) xəstəliyinə tutulmuş; titrətmə-qızdırmalı. *..Titrətməli adamlar kimi dişləri bir-birinə dəyə-dəyə pəncərənin altında çömbəltmə oturdu*. Ə.Abasov.

2. Titrətmə xəstəliyi mənbəyi olan, titrətmə-qızdırma xəstəliyini yayan. *Bağ salır keçmişin məkan tutduğu; Sarı, titrətməli göllərdə gürcü.* M.Müşfiq.

**TİTRƏYİŞ** *is.* Titrəmə, əsmə; titrəmə işi. *Danışdıqca Zeynəbin səsi titrəyirdi, bu titrəyişdə həm dərin bir iztirab, .. həm də incə giley-küsü vardı*. M.İbrahimov. *Veys yorulmuşdu, onun qollarında və dizlərində nə isə bir gizilti və titrəyiş vardı.* Ə.Əbülhəsən.

**TİTRLƏMƏ** *f.is.* Hər hansı məhlulda olan maddələrin miqdarını, onun reaksiyasını, maddələrinin miqdarı məlum olan reaksiyalarla müqayisə edəcək müəyyənləşdirmə.

**TİTRLƏMƏK** *f. kim.* Titrini müəyyən etmək (bax **titrləmə**).

**TİTUL** [*fr.* titulus] 1. Feodal və ya burjua cəmiyyətində: nəsildən-nəslə keçən, yaxud sonradan verilən fəxri ad, rütbə. *İmperator titulu. Knyaz titulu. Xan titulu.*

2. *mətb*. Kitabın sərlövhəsi, adı. // Kitabın adı, müəllifinin adı, nəşr olunduğu il, yer və s. göstərilən birinci səhifəsi.

3. *xüs.* Sovet dövründə: titul siyahısına daxil edilmiş əsaslı tikinti smetasının obyektlər üzrə adı. □ **Titul siyahısı** *xüs.* – layihə və smetası təsdiq olunmuş əsaslı tikinti obyektlərinin siyahısı.

4. *hüq*. Burjua hüquqşünaslığında: hər hansı bir hüququn əsası. *Mülkiyyət titulu*.

**TİYAN** *is.* Adətən içində qır əridilən, dəmirdən və s. metaldan qayrılmış çox iri, dərin qazan. *Qırı tiyana tökmək.* – [Xoca Əziz] *ocağı asıb, qır-saqqızı tökdü tiyana, əridib elədi mum kimi.* "Koroğlu". // İri qazan. *Anbardan sonra Rüstəm bəy bişmiş tiyanına yanaşdı, xörəyi daddı, məmnun qalmadı, ağıza alınası deyildi*. Çəmənzəminli. *Gömgöy su ilə doludur; Qalaylı tiyan.* R.Rza.

**TİYANÇA** *is.* Balaca tiyan, kiçik tiyan. *Qumru qalayı getmiş paxırlı tiyançanı gətirib küncə qoydu*. Mir Cəlal.

**TİYANÇI** bax **qırçı**.

**TİYANÇILIQ** bax **qırçılıq**.

**TİYƏ** *is.* Qılınc, bıçaq və s. kəsici alətlərin kəsən (iti) tərəfi, ağzı. [Zeynal bıçağın] *itiliyini nümunə etmək üçün barmağı ilə tiyəsinə təmas etdi.* Çəmənzəminli. *Bu zorba bıçağın üç-dörd tiyəsi, qayçısı... vardı*. M.Hüseyn.

**TİZFƏHM** *sif.* [*fars.* tiz və *ər.* fəhm] Tez başa düşən, çox anlaqlı, çox zirək, çox fərasətli, zəkalı. *Mansur böyük bir həvəslə oxumaqla bərabər, çox zirək və tizfəhm olduğu üçün arif olanlar gələcəkdə bu yetim cavanı gözəl səadət gözləyəcəyini bilirdilər.* C.Cabbarlı.

**TOĞAY** *is. coğr*. Çay vadilərində meşə, çaybasar meşə.

**TOĞLU** *is.* On aylıq (bəzən də birillik) qoyun balası. *Erkək toğlu. Dişi toğlu*. – [Şərəfnisə xanım:] *Neyləyək, ana, bir-iki yüz toğlu satarıq, genə pul olar*. M.F.Axundzadə.

**TOĞLUBAŞI** *sif. dan.* Tikintiyə yaramayan əyri-üyrü, kələ-kötür daş. *Bəziləri paya kəsib hazırlayır, çayın içinə salınmış iri daşların dalına sancıb şəl basır və böyürlərinə toğlubaşı daşlardan töküb, çayın ağzını əkinlərin üzərindən azdırırdılar*. Ə.Vəliyev. // İs. mənasında. *Toğlubaşıdan divar olmaz*.

**TOX**[1] *sif.* 1. Aclıq hiss etməyən, yeməyə ehtiyacı olmayan, yeyib doymuş (*ac* ziddi). *Tox adam. – Təranə deyir: – Toxam; Yemək istəmirəm mən.* R.Rza. □ **Tox olmaq** – yeyib doymaq, daha yemək istəməmək, ac olmamaq. *Tox oldu, ac qarınlar cümlə doldu*. S.Ə.Şirvani. // İs. mənasında. *Toxun acdan nə xəbəri*. (Məsəl).

2. Bəslənmiş, yedirdilmiş, bəslənib kökəldilmiş, yeyib doymuş. *Tox inəklər quyruqlarını bulaya-bulaya tənbəl-tənbəl yeriyirdilər*. İ.Hüseynov.

3. *məc.* Firavan yaşayan, dövlətli, varlı. *Tox adam. Tox* (z.) *yaşamaq*. // *məc*. Özündənrazı, lovğa, harın. *Rüxsarə xanım Kərbəlayı Səfdə-*

*rin tox və harın sifətini görüb bir söz demədi, ətrafına göz gəzdirdi*. T.Ş.Simurq.

4. *məc.* Təngə gəlmiş, çiyrənmiş, doymuş. "*Sözdən, məhəbbətdən toxam*" *– dedin; İndi də sən məndən həyat istədin.* B.Vahabzadə.

◊ **Gözü tox olmaq** – b a x **göz. Özünü tox tutmaq (saxlamaq)** – özünü saxlamaq, özünü sındırmamaq.

**TOX²** *sif.* Rəng adlarının əvvəlinə gəlib tündlük mənası verir; tünd. *Tox qırmızı.*

**TOXA** *is.* Kətmən. *Pas atır toxalar, bellər, kürəklər; Barmaqlar dincəlir, əllər şad olur.* S.Vurğun. *Kəndli qadın əlində alakeş, kürək, toxa gəlirdi*. Mir Cəlal.

**TOXAC** *is.* Yeri, torpağı, qırı, asfaltı və s.-ni döyüb, ya basıb bərkitmək üçün alət.

**TOXACLAMA** "Toxaclamaq"dan *f.is.*

**TOXACLAMAQ** *f.* Toxacla döyəcləyib (basıb) bərkitmək.

**TOXACLANMA** "Toxaclanmaq"dan *f.is.*

**TOXACLANMAQ** *məch.* Toxacla döyəclənib (basılıb) bərkidilmək.

**TOXALAMA** "Toxalamaq"dan *f.is.*

**TOXALAMAQ** *f.* Kətmənləmək. *Pambıq sahəsini toxalamaq*.

**TOXALANMA** "Toxalanmaq"dan *f.is.*

**TOXALANMAQ** *məch.* Kətmənlənmək. *Bitkilərin arası toxalandı*.

**TOXALMA** "Toxalmaq"dan *f.is.*

**TOXALMAQ** *f. dan.* Yeyib doymaq, tox olmaq. *Ver Çakərə yüz-yüz ki yesin, qarnı toxalsın*. Ə.Qəmküsar.

**TOXQARIN** *is*. Doymuş, ac olmayan, tox. [Həkim kişiyə:] *Yəqin toxqarına özünü soyuğa verib*. Çəmənzəminli.

**TOXLUQ¹** *is.* 1. Tox olma, ac olmama, yeyib doyma (*aclıq* əksi). *Yaxşılıq, yamanlıq, toxluq və aclıq məfhumlarına qarşı yenə yad və laqeyd idim.* Çəmənzəminli. *..Professor toxluqdan təngişən nəfəsini güclə alırdı.* B.Bayramov.

2. *məc.* Harınlıq, lovğalıq. *Aclıq nəyi yedirtməz; Toxluq nəyi dedirtməz?* (Ata. sözü).

◊ **Toxluq etmək (eləmək)** – həddən artıq yeməkdən xəstələnmək. [Rəhim:] *Səfərəlinin fikri odur ki, qonaqları o qədər yedirtsin ki, yazıqlar toxluq eyləyib qırılsınlar*. N.Vəzirov. [Veys:] *Heç eşitməmişəm deyələr, filan dövlətli toxluq eləyib ölüb.* Ə.Əbülhəsən.

**TOXLUQ²** *is.* Tündlük (b a x **tox²**). *Rəng nəzəriyyəsinə görə rəng qüvvəsi onun həm toxluğundan, həm də aclığından asılı olan bir keyfiyyətdir*. A.Qazıyev.

**TOXMACAR** *is.* Çoxillik bitkilərin toxumlarından alınan cavan bitki şitili. *Tut toxmacarı*. – [Nəriman:] *..Dəyirman altındakı açıqlığı .. toxmacar şitilliyi eləyək*. İ.Əfəndiyev.

**TOXMACARLIQ** *is.* Toxmacar əkilmiş sahə, yer. [Suçu:] *Murad dayı, sabah təzə toxmacarlığı suvaraqmı?* İ.Əfəndiyev.

**TOXMAQ** *is.* 1. Ağacdan yonulmuş iribaşlı çəkic, çox yoğun taxta çəkic. *Çadır mıxlarına vurulan toxmaqların səsi Culfa dağlarını və Əlincik qalasını titrədirdi.* M.S.Ordubadi.

2. Dəyənək, çomaq, kötək. *Çoban toxmağı. – Divanəmisən? Yaxud da axmaq; Get, yoxsa yeyərsən əlli toxmaq.* Xətayi.

3. Keçmişdə qapını döymək üçün qapılara asılan çəkicəoxşar alət. *Həmzə ilə işi olan muzdur darvazanın dəmir toxmağını döyəndə Əminə darvazanı açardı*. Ə.Əbülhəsən.

4. Paltarı suyun içində döyəcləyib təmizləmək və ya başqa məqsədlər üçün istifadə edilən bir başı qalın və yastı ağac parçası.

◊ **Nə tüfəngə çaxmaq(dır), nə sünbəyə toxmaq; nə tüfəngin çaxmağıdır, nə sünbənin toxmağı** – əlindən heç bir iş gəlməyən, heç bir işə yaramayan adam haqqında. *Nə tüfəngə çaxmaq, nə sünbəyə toxmaq*. (Ata. sözü). *Bir tanış var, kəsilməyir yanımızdan ayağı; Nə tüfəngin çaxmağıdır, nə sünbənin toxmağı*. S.Vurğun.

**TOXMAQCIQ** *is.* 1. Kiçik toxmaq, balaca toxmaq.

2. *bot.* Yoğun, bəzən ətləşmiş, sünbülə oxşayan ot-bitki.

**TOXMAQÇİÇƏKLİ(LƏR)** *cəm bot.* Birləpəli bitkilərin daxil olduğu bitki sırası.

**TOXMAQLAMA** "Toxmaqlamaq"dan *f.is.*

**TOXMAQLAMAQ** *f.* Toxmaqla vurmaq, döymək. *Keçəni toxmaqlamaq.*

**TOXMAQLANMA** "Toxmaqlanmaq"dan *f.is.*

**TOXMAQLANMAQ** *məch.* Toxmaqla vurulmaq, döyülmək.

**TOXMAQLI** *sif.* 1. Əlində və ya yanında toxmaq olan.

2. Toxmağı olan (b a x **toxmaq** 3-cü mənada). *Toxmaqlı qapı. – Dəmir toxmaqlı darvazalar tez-tez açılıb-örtülür.* Ə.Əbülhəsən.

**TOXTAQ** *sif.* və *zərf* Sakit, rahat, aram, arxayın. *Yusif yenə də toxtaq danışır, sabah hər şeyin aydın ola ağını inamla söyləyirdi.* B.Bayramov. ◻ **Toxtaq vermək** – b a x **toxtaqlıq vermək** ("**toxtaqlıq**"da). [Kərbəlayı Fatma:] *Kişi, gəlib eləyən yoxdur. Özünə toxtaq ver. Səni qara basıb.* M.Əliyev. *Salman vaxtında cilovu çəkib,* [Mayaya] *toxtaq verdi.* M.İbrahimov. **Özünü toxtaq saxlamaq** – b a x **toxtamaq** 1-ci mənada. [Piri baba:] *Özünü itirmə, toxtaq saxla.* S.S.Axundov. [Gülməmməd:] *Özünü toxtaq saxla, budur, camaat qayıdır.* Ə.Haqverdiyev.

**TOXTAQLANMA** "Toxtaqlanmaq"dan *f.is.*

**TOXTAQLANMAQ** b a x **toxtamaq** 1-ci mənada. [Dərviş:] *Özümə gəldim, toxtaqlanıb, özümü Ruqiyyənin üstünə saldım.* A.Divanbəyoğlu.

**TOXTAQLIQ** *is.* Toxtaq olma; arxayınlıq, xatircəmlik, rahatlıq, səbir, dözüm. *Toxtaqlıq, təskinlik bədbəxt hadisəni geri qaytarmır.* Ə.Vəliyev. ◻ **Toxtaqlıq vermək** – b a x **toxtatmaq**. *Haya gələn ağsaqqal, qarasaqqal Rüstəmə toxtaqlıq verməyə başladı.* S.Rəhimov. *Sərvinaz qarı kişinin fikrini başa düşmüş, ona toxtaqlıq vermişdi.* B.Bayramov.

**TOXTAMA** "Toxtamaq"dan *f.is.*

**TOXTAMAQ** *f.* 1. Dayanmaq, dözmək, səbir etmək, duruxmaq; sakit olmaq, özünü saxlamaq, özünü ələ almaq. *Sən bir toxta. Toxta görüm. – Gülsəhər bir az toxtadı.* Ə.Vəliyev. *İsa burada toxtayıb, bir az təşvişlə arvadı Güllüyə baxdı ki, bunun da səbəbi vardı.* Ə.Əbülhəsən. // Dayanmaq, kəsilmək, sakitləşmək (ağrı haqqında). *Dişin ağrısı bir az toxtadı.*

2. Bir yerə gəlib çatmaq, yetişmək, çatıb dayanmaq. *Biz gəlib kənddə toxtadıq.*

**TOXTATMA** "Toxtatmaq"dan *f.is.*

**TOXTATMAQ** *f.* Sakit etmək, rahat etmək, toxtaq vermək. *Miraxur özünü toxtatmaq üçün çubuğa bir qullab vurdu.* Çəmənzəminli. *Gecənin sərinliyi sinəsinə dolub* [Xanpərini] *toxtadırdı.* Ə.Vəliyev.

**TOXUCU** *is.* 1. Dəzgahda parça və s. toxuyan fəhlə, usta. *Alimlər də, toxucular da bu fikirdədirlər ki, Əzizin tapdığı və təcrübə üçün əkdiyi toxumun böyük gələcəyi vardır.* Ə.Vəliyev. // Sif. mənasında. *Toxucu qızlar.*

2. B a x **toxuculuq** 1-ci mənada. *Bakıda işçilər tətil etmişlər, toxucu fabriki tətilçilərin əlindədir.* H.Nəzərli. *Toxucu karxanaları bağlanır, darvazalar tez-tez açılıb-örtülürdü.* Ə.Əbülhəsən.

**TOXUCULUQ** *is.* 1. Yüngül sənayenin parça toxumaqla məşğul olan sahəsi. *Toxuculuq fabriki.*

2. Toxucunun sənəti, peşəsi, işi. *Toxuculuq kursu.*

**TOXUM** *is.* [*fars.*] 1. Ali bitkilərin adətən mayalanmadan sonra inkişaf edən və maya ilə qabıqdan ibarət olan rüşeymi; tum. *Keşniş toxumu. – Şair ilə Afaq ləklərə çiçək, yonca toxumu səpib, çəpər boyu cavan ağaclar əkdilər.* Ə.Məmmədxanlı. *Gülqönçə toxumları yığmaq istəyir.* H.Seyidbəyli. // Bitkilərin yemək üçün və ya başqa məqsədlərlə istifadə olunan rüşeymi (tumu). *Şirli bardaqlarda içinə reyhan toxumu salınmış şərbətlər qoyuldu.* Çəmənzəminli.

2. Əkmək üçün ayrılmış dən. *Əla toxum cinsi. – Kiminin öküzü, çoxunun toxumu, bəzilərinin də cütü yox idi.* Ə.Vəliyev.

3. *fiziol.* Sperma, döl. *Merinos qoyununun toxumu.* // Nəsil, soy, döl.

◊ **Toxumu (toxumunuz) kəsilsin! (yer üzərindən götürülsün!)** – qarğış ifadəsi. [Hacı Qara:] *Səni lənətə gələsən arvad, toxumunuz yer üzündən götürülsün!* M.F.Axundzadə.

**TOXUMA** 1. "Toxumaq"dan *f.is.* *Toxumanı davam etdirmək üçün ip sol əlin şəhadət barmağı üzərində eyni qaydada saxlanılır.*

2. *is.* Toxunmuş arşınmalı, parça. İpək toxuma. *Dekorativ toxuma.*

3. *is. biol.* Bir-birilə bağlı olan və orqanizmdə eyni vəzifələri görən eynicinsli hüceyrə qrupu. *Əzələ toxuması. Birləşdirici toxuma.*

**TOXUMAQ** *f.* 1. Uzununa (əriş) və eninə (arğac) sapları bir-birinin arasından keçirməklə parça, xalça və s. hazırlamaq. *Mahud toxumaq. Çit toxumaq. – Mürgüləyir nənəm taxıb çeşməyi; Düşür yerə toxuduğu əlcəyi.* A.Səhhət. [Sarıköynək] *çox vaxt həyətdə oturub həsir toxuyardı.* S.Hüseyn. // Eyni üsulla

parça üzərində naxış, şəkil hörmək. *Təkəlduz toxumaq. Buta toxumaq.*

2. Hörmək. *Ağabəyim bütün günü .. rəngin xəzəldən çələng toxuyur, dayəsinə min bir sual verirdi*. Çəmənzəminli. *Çələng toxumağa, gül var, çiçək var*. N.Xəzri.

3. "**Özünü**" sözü ilə – b a x **vurmaq** 20-ci mənada. *Fatma qırğı kimi özünü təndirə toxuyur, kəhrəba kimi sarı çörəkləri əlində çıxarıb, buğlana-buğlana süfrənin üstünə atırdı*. Mir Cəlal.

4. *məc. dan.* Uydurmaq, özündən quraşdırmaq. *Yalan toxumaq.*

**TOXUMCUQ** "Toxum"dan *kiç*. Tumcuq.

**TOXUMÇU** *is.* Toxumçuluq mütəxəssisi.

**TOXUMÇULUQ** *is.* 1. Bitkiçiliyin, toxumçuluq bitkilər yetişdirmək və cins toxumlar almaqla məşğul olan sahəsi. *Toxumçuluq sovxozu. Toxumçuluq təcrübə stansiyası.*

2. Toxumçunun işi, peşəsi, ixtisası. *Toxumçuluqla məşğul olmaq*.

**TOXUMLAMA** "Toxumlamaq"dan *f.is.*

**TOXUMLAMAQ** *f.* 1. Toxum əmələ gəlmək, toxumu yetişmək. *Kələm toxumladı*.

2. *dan.* Toxum səpmək. *Ləkləri toxumlamaq*.

**TOXUMLUQ** *is.* 1. Toxum kimi əkilmək üçün ayrılmış dən; tumluq. *Mirzə Valeh arpadan .. ayırıb, gələcək toxumluq üçün saxladı.* S.Rəhimov. *Səriyyə isə buğdaları yoxlayıb, gələn il üçün toxumluq ayırırdı*. M.Hüseyn. // Sif. mənasında. *Əkmək üçün yararlı, əkilmək üçün ayrılmış; tumluq. Toxumluq qarğıdalı*. // Toxum almaq üçün əkilmiş sahə. *..Tarla və bostanların toxumluqları belə çalınmışdı.* Çəmənzəminli.

2. *fiziol*. Erkək cinsiyyət vəzisi. *Erkəklərin toxumluq adlanan çoxalma üzvləri də qoşa olur. Toxumluqlar içərisində spermatozoid adlanan toxum hüceyrələri əmələ gəlir*. "Zoologiya". // *bot.* Çiçəyin toxum əmələ gələn hissəsi. *Çiçəyin toxumluğu yuxarıda çox vaxt 3 yuvalı, bəzi hallarda isə 4 və ya 6 yuvalı olur*. "Çay bitkisi".

**TOXUMSƏPƏN** *sif.* Toxum səpməyə məxsus (maşın); əllə toxum səpən (adam). [Malik] *yaxın günlərdə kolxozun bir traktor və iki toxumsəpən maşın alacağını bildirdikdə isə hamı "çox sağ ol, çox sağ ol!" – deyib sevindi.* M.İbrahimov. // İs. mənasında. Toxumsəpən maşın. *Toxumsəpənləri təmir edirlər*. M.İbrahimov.

**TOXUNAN** *is.* və *sif. riyaz.* Əyri xətlə bir ümumi nöqtəsi olan, lakin onunla kəsişməyən (düz xətt). *Çevrəyə toxunan çəkmək*.

**TOXUNDURMA** "Toxundurmaq"dan *f.is.*

**TOXUNDURMAQ** *f.* Toxunmasına səbəb olmaq; dəydirmək. *İki şeyi bir-birinə toxundurmaq. Əlini topa toxundurmaq.*

**TOXUNMA¹** "Toxunmaq¹"dan *f.is.*

**TOXUNMA²** 1. "Toxunmaq²"dan *f.is.*

2. *sif.* Toxunmuş, trikotaj. *Toxunma məmulat.*

**TOXUNMAQ¹** *f.* 1. Əl və ya bədənin başqa bir üzvü ilə bir şeyə dəymək, təmas etmək, əlini vurmaq. [Vaqif] *qeyri-ixtiyari olaraq əlini pəncərəyə tərəf hərləyəndə güldana toxunub saldı.* Çəmənzəminli. *Diyar kişi dirsəyi ilə arvadına toxunub pıçıldadı...* Ə.Məmmədxanlı.

2. Əl vurmaq, qarışdırmaq, dəymək. *Mənim şeylərimə toxunma! Bu kitablara kim toxunub? Heç kəs bu kağızlara toxunmasın.*

3. *məc.* Üstündə ötəri dayanmaq, bəhs etmək, danışmaq.

4. *məc.* Pis təsir etmək, təhqir etmək, könlünə dəymək, sataşmaq. *Könlünə toxunmaq.* – *Qismət olsa, bundan belə yazmaram; Toxunarsa sözüm elə, yazmaram.* M.Ə.Sabir. *Bu sual şəfqət bacısına toxundu*. Ə.Sadıq. // *məc*. İnkar şəklində: **toxunmamaq** – əl dəyməmək, işi olmamaq, dəyməmək, dəyib-dolaşmamaq, sataşmamaq. *Mənə toxunma!* – *..Anatoli işarə etdi ki,* [faşistə] *toxunmasınlar, çünki əsas plan pozula bilər.* S.Vəliyev. *Bu eybəcər quşa kimsə toxunmaz; Səsindən, özündən həzz alaq deyə*. B.Vahabzadə.

5. *məc.* Aidiyyəti olmaq, əlaqəsi olmaq, dəxli olmaq. *Bu məsələ mənə toxunmur.* – *Çingiz .. müsəlman "zemlyaçestvo"sunun sədri olduğu üçün bu şikayətlər ən əvvəl ona toxunurdu*. Çəmənzəminli.

**TOXUNMAQ²** "Toxumaq"dan *məch. Parça toxunmaq. Əlcək toxunmaq. Xalça toxunmaq*. – [Nəcəfalının] *əynində güzəmdən toxunmuş* (f.sif.) *şalvardan, çit köynəkdən başqa heç nə yox idi*. B.Bayramov.

**TOXUNMUŞ** *f.sif.* Toxunmaqla hazırlanmış. *Toxunmuş jaket.*

**TOXUNULMAZ** *sif.* 1. Vaxtı çatana qədər qorunub saxlanılmalı olan, istifadə olunmayan, sərf olunmayan, işlənməyən. *Toxunulmaz ehtiyat. Toxunulmaz fond.* // *məc.* Heç kəsin toxunmağa, qəsd etməyə, pozmağa ixtiyarı olmayan. *Elə bil* [Həmişəyevin] *toxunulmaz hörmətinə zədə dəymişdi.* B.Bayramov.

2. Birinin toxunmasından, qəsdindən qanunən qorunan, qanunun himayəsi altında olan. *Toxunulmaz şəxsiyyət.*

**TOXUNULMAZLIQ** *is.* Toxunulmaz şəxs, ya şeyin halı. *Diplomatik toxunulmazlıq.*

**TÓKAR** [*rus.*] b a x **tornaçı**. *Bəli,* [Həsən] *tokar olacaqdı.* H.Seyidbəyli.

**TOKARLIQ** b a x **tornaçılıq**.

**TOKKÁTA** [*ital.*] *mus.* Fortepiano və ya orqanda sürətlə və canlı ritmik hərəkətlə ifa olunan musiqi pyesi.

**TOKSEMÍYA** [*yun.* toxikon – zəhər və haima – qan] *tib.* Toksinin qana düşməsi nəticəsində orqanizmin zəhərlənməsi.

**TOKSÍK** *sif.* [*yun.* toxikon-dan] 1. Zəhərli, zəhərləyici. *Toksik maddələr. Nikotinin toksik təsiri.*

2. Toksinin təsiri nəticəsi olan. *Sinir sisteminin toksik zədələnməsi.*

**TOKSİKOLÓGİYA** [*yun.* toxikon – zəhər və logos – elm] Zəhərləri və onların orqanizmə təsirinin xüsusiyyətlərini öyrənən elm.

**TOKSİKOLOJÍ** "Toksikologiya"dan *sif.*

**TOKSİKÓLOQ** [*yun.* toxikon və logosdan] Toksikologiya mütəxəssisi.

**TOKSİKÓZ** [*yun.* toxikon-dan] *tib.* Orqanizmin, zəhər və zəhərli maddələrin (toksinlərin) təsiri nəticəsində əmələ gələn xəstəlik vəziyyəti.

**TOKSÍN** [*yun.* toxikon – dan] *biol.* və *tib.* Bəzi mikroorqanizmlərdə, eləcə də bəzi heyvanlarda və bitkilərdə əmələ gələn zəhərli maddələr.

**TOKSOPLAZMOZ** *is. tib.* İnsan və heyvanlarda toksoplazmaların törətdiyi parazitar xəstəlik.

**TOQQA** *is.* Qayışı, kəməri çəkib bağlamaq üçün onun başında olan qarmaqlı bənd. *Sübhanverdizadə dərindən nəfəs alaraq yan yemək otağına keçdi. Yaxasının düymələrini açdı və toqqasının dilini boşaltdı.* S.Rəhimov. [Xasay] *bu əmri birinci olaraq yerinə yetirdi. Toqqasını bərkidib düzəltdi.* Ə.Vəliyev. // Ümumiyyətlə, kəmər, qayış. *Axırda Dəmirçioğlu atasından gizlin bir canlı kotan zəncirini də götürüb, toqqa əvəzinə belinə bağladı, Çənlibelə tərəf yola düşdü.* "Koroğlu". [Musanın] *ensiz toqqasına həmişə ya qəzet, ya da kitab sancılmış olardı.* B.Bayramov.

◊ **Toqqanın altını bərkitmək** *zar.* – yaxşıca yemək. *Toqqanın altını bərkidib aşıq; Bir də telli sazı basır bağrına.* H.Hüseynzadə.

**TOQQAC** *is.* Yorğan-döşək, palaz və s. çırpmaq üçün nazik çubuq. *Gülaranın palazlara, gəbələrə endirdiyi toqqacların taqqıltısı ətrafa yayılırdı.* Ə.Vəliyev.

**TOQQACLAMA** "Toqqaclamaq"dan *f.is.*

**TOQQACLAMAQ** *f.* Toqqacla vurmaq, toqqacla çırpmaq.

**TOQQALANMA** "Toqqalanmaq"dan *f.is.*

**TOQQALANMAQ** *f.* 1. Belinə toqqa (qayış, kəmər) bağlamaq. [Əlisgəndər] *köynəyini geyib toqqalandı.* Ə.Vəliyev. [Milis müvəkkili] *şıq geyinmişdi, sığallanıb toqqalanmışdı.* B.Bayramov.

2. Bir şeyi ortasından toqqa, qayış və ya iplə bağlamaq. [Rizvanın] *ortadan toqqalanmış* (f.sif) *çamadanını Nənəqız darvazanın ağzında əlindən alıb boynunu qucaqladı.* S.Rəhimov.

**TOQQALI** *sif.* 1. Belinə toqqa bağlamış; qayışlı, kəmərli. *Yaxası açıq, toqqalı, pencəksiz, nazik bir oğlan içəri girdi.* Mir Cəlal.

2. Toqqa, qayış, ip və s. ilə bağlanmış. *Toqqalı məfrəş.*

**TOQQUŞDURMA** "Toqquşdurmaq"dan *f.is.*

**TOQQUŞDURMAQ** *f.* Bir-birinə toxundurmaq, bir-birinə vurmaq. *Maşınları toqquşdurmaq.* // *məc.* Aralarında ziddiyyət yaratmaq, aralarını vurmaq, dalaşdırmaq, toqquşmalarına səbəb olmaq. *Qonşuları toqquşdurmaq. – Görünür, vəziyyət özü* [Tərlanı] *Əlyarovla toqquşduracaqdı.* M.Hüseyn.

**TOQQUŞMA** 1. "Toqquşmaq"dan *f.is.*

2. Mübahisə, münaqişə, sözə gəlmə, dalaşma, dava-dalaş. [Həcər xanım:] *Şəmsinin fikrini anlayıram, o qorxur ki, yenə aralarına toqquşma düşər.* S.S.Axundov. *Elə bil* [Mirzə Polad] *heç Müqim bəylə üz-üzə gəlməmiş,*

*onların arasında heç bir toqquşma olmamışdır*. S.Rəhimov.

3. Vuruşma, çırpışma, döyüş. *Elə bu zaman polislə nümayişçilər arasında ilk toqquşma oldu*. S.Rəhman.

**TOQQUŞMAQ** *f.* 1. Qarşı-qarşıya hərəkət edərkən üz-üzə gələrək bir-birinə bərk toxunmaq, dəymək, çarpmaq. *Qatarlar toqquşdu. – ..Hovuzun bu başından girib, o biri başına çatana qədər on adama toqquşursan.* Çəmənzəminli. // *məc.* Aralarında ziddiyyət baş vermək; dalaşmaq, küsüşmək. *Yenə də Şəfiqə ilə Zeynal toqquşdular.* H.Seyidbəyli.

2. Gözlənmədən təsadüf etmək, təsadüfən rast gəlmək, birdən rastlaşmaq, üz-üzə gəlmək. *Komendant özünü itirmiş halda qayıdıb çölə çıxarkən qapıda Həkimülmülk və sərtib Səlimi ilə toqquşdu.* M.İbrahimov.

3. Üz-üzə gəlib vuruşmağa başlamaq; döyüşmək, vuruşmaq. *Düşmənlə toqquşmaq*.

4. *məc.* Maraqları, mənafeləri, əqidələri, tələbləri müxtəlif olduğu üçün bir-biri ilə mübarizə aparmaq. [Saltik:] *Şübhə yox, toqquşacaq xeyirlə şər.* A.Şaiq. *Gülşən indi toqquşan* (f.sif.), *çarpışan iki fikir arasında qalmışdı*. Ə.Vəliyev.

**TOL** [*fr.*] Damı örtmək üçün xüsusi tərkibli maddə hopdurulmuş karton.

**TOLAZLAMA** 1. "Tolazlamaq"dan *f.is.*

2. Bax **atmaca**. [Şamo:] *Camaat içində mənə bir tolazlama söz atdı*. S.Rəhimov.

**TOLAZLAMAQ** *f.* Əlini dala gərərək bir şeyi uzağa atmaq, tullamaq. [İmamverdi:] *A qız* [Sona], *o nədir tolazlamısan səlbəni, gedib dəyib Haykanuşun danasının gözünə?* C.Cabbarlı. *Qaraca çoban əlindəki məşəli və çomağı bir-bir yaxınlaşan atlılara sarı tolazlayıb bir neçəsini atdan yıxdı.* M.Rzaquluzadə.

**TOLSTÓVKA** [Yazıçı L.N.Tolstoyun adından] Qırçınları olan kəmərli, enli, uzun kişi üst köynəyi. *Mirzə Mustafanın zahiri sifəti başqalarından seçilmirdi üzü qırxıq, bığları gödək kəsilmiş, başında fəhlə kepkası, əynində tolstovka xələti və i.a.* E.Sultanov.

**TOLSTOYÇULUQ** *is.* [Yazıçı L.N.Tolstoyun adından] Öz dövrünün ictimai quruluşunu və mədəniyyətini patriarxal kəndli mövqeyin ən tənqid və inkar edən və əxlaqi təkmilləşmə və pisliyə qarşı müqavimət göstərməmək ideyasını təbliğ edən dini-etik nəzəriyyəsi.

**TOLUOL** *is.* [*isp.*] İyli, yanar rəngsiz maye.

**TOMAĞA** *is*. Bəzi quşların (o cümlədən bəzi toyuqların) başındakı kəkil. *Laçın təki başda ala tomağa; Yaşmağı tutmaya dişə, dodağa.* M.P.Vaqif. // Bəzi bitkilərin yumru və ya qoza şəklində olan toxumluğu.

**TOMAĞALI** *sif.* Tomağası olan, kəkilli. *Tomağalı toyuq*.

**TOMÁT** [*isp.*] Pomidor pastası (sousu). *Tomatda bişirilmiş balıq.*

**TOMATLI** *sif.* Tomat tökülmüş, tomatla bişirilmiş. *Tomatlı şorba.*

**TOMBUL** *sif. dan.* Ağ və yumşaq. *Ağ tombul pambıqlar da; Açılar tarlalarda*. N.Rəfibəyli. // Ağ və koppuş. *Anuş o tombul, o pambıq əllərini mənə uzadırkən: – Biz çoxdan tanışıq! – deyə əlini tutdum*. A.Şaiq.

**TOMOQRAFİYA** *is.* [*yun.*] Rengenoloji müayinə üsulu.

**TOMPAK** *is.* [*fr.*] Bürüncün bir növü.

**TON**[1] [*fr.*] Metrik ölçü sistemdə 1000 kiloqrama bərabər çəki vahidi.

**TON**[2] [*yun.* tonos – səsin yüksəldilməsi] 1. *fiz*. Havanın dövraşırı titrəyişindən ibarət olub onun yüksəklik dərəcəsini müəyyən edən səs. *Yüksək ton. Aşağı ton*. // Müəyyən yüksəklikdə plan musiqi səsi.

2. *tib.* İşləyən ürəyin, onun qapaqlarının səsi; insan bədəninin içiboş üzvlərini tıqqıldadanda çıxan səs. *Ürəyin tonu.*

3. *mus.* İki yarımtondan ibarət olan və səsin yüksəkliyinə görə fərqini müəyyənləşdirmək üçün vahid kimi götürülən interval. *Ariyanı iki ton aşağı salmaq*.

4. *mus.* Tonallıq. *Major ton. Minor ton.* // *məc.* Emosional əhvali-ruhiyyə. *Şerin major tonu*.

5. Musiqi alətinin və ya səsin səslənmə çaları, xüsusiyyəti. *Təmiz ton. Fortepianonun tonu.* // İfaçının alətə və ya səsə verdiyi səslənmə xüsusiyyəti. // Danışan adamın səsinin yüksəkliyi və ya gücü; səs. *Səsinin tonunu qaldırmaq. – Uzun bir nitq söyləməyə hazırlaşmış kimi görünən katib birdən səsini alçaldıb danışığın tonunu dəyişdi..* Ə.Sadıq.

6. Nitqin səslənməsinin xarakteri, danışanın (və ya yazanın) hisslərini, onun haqqında danışdığı şeyə olan münasibətini, əhvali-ruhiyyəsini və s.-ni ifadə edən tələffüz (və ya yazı) xüsusiyyəti, tərzi. *Amiranə ton. Mülayim ton. – Səlim bəzən acıqlı-acıqlı, bəzən həyasız bir tonda cavab verirdi.* M.İbrahimov. // Üslub, ifadə tərzi. *Tənqidi məqalənin tonu.*

7. Rəng, çalar, habelə hər hansı bir rəngin açıqlıq və ya tündlük dərəcəsi. *Açıq tonlar. Tünd ton. – Rəng tonu yalnız xromatik rənglərə mənsub olub, rəngin qırmızıya, sarıya və s. çalmasını müəyyən edir.* A.Qaziyev.

◊ **Ton vermək** – işin gedişini lazımi istiqamətə yönəltmək.

**TONÁL** [*yun.*] 1. *mus.* Bir tondan başqa tona keçmə (b a x **ton²** 1 və 5-ci mənalarda).

2. *mus.* və *inc.* Tonallığa aid olan (b a x **tonallıq**). Musiqi əsərinin tonal quruluşu.

**TONALLIQ** *is.* 1. *mus.* Musiqi ladının (kökünün), xromatik qammanın bu və ya digər pərdəsinin düzülüşündən asılı olaraq çıxardığı səslərin səciyyəvi xüsusiyyəti. *Do major tonallığı. Si bemol minor tonallığı.*

2. *inc.* Rəsmdə hər hansı bir əhvali-ruhiyyə əmələ gəlməsinə kömək edən əsas, üstün rəng, kolorit. *Tonallığın pozulması.*

**TON-KİLOMETR** *is. xüs.* Bir ton yükü bir kilometr məsafəyə aparmaq əsasında hesablanan yükdaşıma vahidi.

**TONQAL** *is.* Yanan, yaxud yandırmaq üçün üst-üstə yığılmış odun, çör-çöp, şax-budaq və s. yığını. *Bir neçə tayqada sönən tonqalın; İstisi şerimdə, sözümdə qaldı.* N.Xəzri. [Qarı:] *Çobanlardır, tonqal qalayıblar, – dedi, – gedək, biz də qızınıb paltarımızı qurudaq.* Ə.Məmmədxanlı.

**TONQALOTU** *is. bot.* İri çiçək qrupu və sünbülcükləri olan ot-bitki.

**TONLUQ** *sif.* Rəqəmlərdən sonra gələrək maşının neçə ton yük apardığını, kranın neçə ton qaldırdığını və s. bildirir. *25 tonluq maşın.*

**TON-MİL** *is. dəniz.* Bir ton yükü bir mil məsafəyə aparma əsasında hesablanan gəminin yükdaşıma vahidi.

**TONNÁJ** [*fr.*] 1. *dəniz.* Gəminin (gəmilərin) sututumu və ya yükgötürmə, yükdaşıma qabiliyyəti. *Gəminin tonnajı.*

2. *xüs.* Nəqliyyat vasitələrinin, nəqliyyatın yükgötürmə, yükdaşıma qabiliyyəti. *Vaqonun tonnajı. Təyyarənin tonnajı.*

3. *xüs.* Hər hansı bir məhsulun çəki ilə buraxılması.

**TÓNUS** [*lat.* tonus, əsli *yun.* tonos – gərginlik] 1. *fiziol.* Sinir sisteminin və əzələ toxumalarının yorğunluq törətməyən uzunmüddətli qıcıqlanması (fəaliyyəti). *Toxumaların tonusu. Sinir sisteminin tonusu.*

2. *məc.* Həyat fəaliyyəti, fəaliyyət.

**TONYARIMLIQ** *sif.* 1500 kiloqram yük götürən. *İsti və bürkülü iyun günlərinin birində tonyarımlıq yük maşını Dəmirçilər kəndində kolxoz idarəsinin qabağında dayandı.* Ə.Vəliyev. *Qafar tonyarımlıq maşına atılıb, kəsə yolda toz qopara-qopara usta dalınca getdi.* Q.İlkin.

**TOP¹** *is.* Bərk səthə dəyəndə geri sıçrayan elastik materialdan hazırlanmış bütöv və ya içiboş şar. *Futbol topu. Voleybol topu. Rezin top. Topla oynamaq.*

◊ **Top kimi (sağlam)** – çox sağlam, heç bir xəstəliyi olmayan, sapsağlam. *Canımız top kimi sağlam, qıvraq.* M.Müşfiq. *Sıralarda oturan sakit, top kimi sağlam kənd uşaqları müəllimlərinin xasiyyətinə öyrənmişdilər.* Mir Cəlal.

**TOP²** *is.* 1. Artilleriya silahlarının ümumi adı. *Artilleriya topu. Zenit topu. – Evlərin ürəyi qopur yerindən; Sarsılır varlığı top səslərindən.* M.Rahim. // Uzunlüləli artilleriya silahı. *Uzunlüləli top.* □ **Topa tutmaq** – hədəfə top atmaq, top atəşi açmaq. *Az qalıb bizimçün qiyamət qopa; Tutacaqlar bizi bu saat topa.* H.K.Sanılı. [Cavad:] *De görək, Qarabağda kəndliləri topa tutan kimdir?* H.Nəzərli.

2. *tib.* Radioaktiv maddələrin şüaları ilə müalicə edən cihaz. *Kobalt topu.*

3. *şahm.* Diaqonal üzrə istənilən qədər hərəkət edən fiqur. *Topla şah elan etmək. – Hər bir oyunçunun bir şahı, iki veziri, iki topu, iki fili, iki atı və səkkiz piyadası olur.* "Şahmat oyunu".

◊ **Top gülləsi (mərmisi) kimi partlamaq** – bərkdən səslənmək, bərk səs çıxarmaq, beyni sarsıtmaq. *Bu səs işçilərin qulağında bir top mərmisi kimi partladı.* H.Nəzərli. *Şofer maşını işə salanda motorun gurultusu*

*top gülləsi kimi Rüstəmin başında partladı.* M.İbrahimov. **Top kimi açılmaq** – birdən hiddətlə bərk qışqırmaq. *Sübhanverdizadə Kosanın üstünə top kimi açıldı.* S.Rəhimov. **Top kimi partlamaq** – b a x **top gülləsi (mərmisi) kimi partlamaq**. [Ağa:] *Bir də eşitdim, bir şey top kimi partladı.* Ə.Haqverdiyev.

**TOP**[3] *is.* 1. Nazik taxtaya sarınmış və ya lülə şəklində parça, arşınmalı. *3 top ağ.* – [Əsgər bəy:] *Mən ki bilirəm,* [Hacı Qara], *Ağcabədidə üç aydır üç top çit, qədək satmayıbsan, dərya zərərin vardır.* M.F.Axundzadə. [Mirzədadaş:] *O mahud topunu bəri ver, görüm necə şeydir..* N.Vəzirov. // Girdə saralmış kağız, divar kağızı və s. *Bir top kağız.*

2. Eynicinsli və ya əlaqədar şeylərin toplusu, komplekti. *Bir top iynə.*

3. Təkərdə dəndələrin və ya dəyirman pərlərinin bənd edildiyi hissə.

4. Top halında yığılıb bağlanmış şeylər. *Topları maşına yükləmək.* – *Çamadanın içində ən əvvəlcə bir neçə top ağ köynək və zircamə və bir neçə dənə ağ dəsmal vardı.* S.M.Qənizadə. // *sif.* Toplu, toplanmış, cəm. [Xan:] *İlyas, – dedi, – ə, ağlın başında heç topdurmu?* S.Rəhimov.

◊ **Top etmək (eləmək)** – b a x **toplamaq**. [Xan:] *Əşi, ağlını başına top elə!* S.Rəhimov.

**top-top** *sif.* Çoxlu, toplarla. *Burada nə yoxdur, qəfəslərdə top-top çit, parça...* Ə.Əbülhəsən.

**TOPA** *sif.* və *is.* 1. Qalaq, yığın. *Torpaq topası.* – *Dəyədən bir az aralıda, topa şeylərin arasında Rüxsarə bükülüb uzanmışdı.* S.Rəhimov. [Hatəm] *..xırman topasının qabağında oturmuşdu.* Ə.Əbülhəsən.

2. Bir yerə toplaşmış, bir yerə yığılmış adamlar; dəstə, yığın. *Başqa bir topa uşaq da Xəzər sahilindən .. söhbət açıb keçirdiyi günlərdən qızğın danışırdı.* S.Rəhimov. *..Sahibkarlar və dükançılar dayanan topadan kimsə bərkdən səsləndi.* Ə.Əbülhəsən. // Eyni mənada heyvanlar haqqında. *Tapdıq papağını çıxarıb, kəpənək topasının üstünə atdı.* Ə.Vəliyev.

3. Sıx, qalın (*seyrək* ziddi). *Qalın topa birçəkləri öz qanilə boyanmış; Bağlarının kənarı da qan laxtası dayanmış.* A.Səhhət. *Vəli kişi topa saqqalını sığallayıb, qəti və bir az da acıqlı etiraz etdi.* M.İbrahimov.

**topa-topa** *sif.* və *zərf* 1. Qalaq-qalaq, yığın-yığın. *Aşağılarda kəndin üstündə .. topa-topa buludlar hərəkət edirdi.* M.İbrahimov.

2. Dəstələr halında, dəstə-dəstə, yığın-yığın. *Ətrafda bütün damlar üstündə adamlar topa-topa dayanıb, qərbə tərəf boylanırdılar.* Ə.Məmmədxanlı. *Meydançada dəstə-dəstə; Kiçikyaşlı vətəndaşlar; Oynayırlar, qaçışırlar; Topa-topa, qatar-qatar.* N.Rəfibəyli.

**TOPACIQ** *is.* Kiçik topa, kiçik qalaq. *Pambıq topacığı. Qar topacığı.*

**TOPAÇİÇƏK** *sif. bot.* Çiçəkləri topa şəklində olan. *Topaçiçək ot.* □ **Topaçiçək dəlicincilim** *bot.* – üstü tüklə örtülü birillik ot bitkisi.

**TOPAL** *sif.* 1. Bir ayağı, ya bir qolu şikəst və ya o birindən qısa olan. [Məmmədin] *ayaq barmaqları yanmış və ayaqları da topal bir şəkil almışdı.* T.Ş.Simurq. *O gündən bir qolu topal* (z.) *yaşadı;* "*Topal Gəray*" *deyə, çağrıldı adı.* S.Vurğun.

2. *məc.* Ayaqlarından biri sınıq olan. *Topal stol.*

◊ **Topal olmuş** – qarğış məqamında işlədilir. [Əhməd:] *..Onu mən tanıyıram, bax odur ey, topal olmuş gəlir, mən getdim.* N.Vəzirov. **Topal yulafca** *bot.* – b a x **topalaq**.

**TOPALAQ** *is. bot.* Kökü xalq təbabətində işlədilən soğanaqlı bitki.

**TOPALAMA** "Topalamaq"dan *f.is.*

**TOPALAMAQ** *f.* Yığıb topa halına gətirmək, bir yerə yığmaq; qalaqlamaq, toplamaq. *Otu topalamaq. Samanı topalamaq.*

**TOPALANMA** "Topalanmaq"dan *f.is.*

**TOPALANMAQ** *məch.* Bir yerə yığılıb topa halına gətirilmək, bir yerə yığılmaq, toplanmaq. *Qurudulmuş pambıq topalandı.*

**TOPALAŞMA** "Topalaşmaq"dan *f.is.*

**TOPALAŞMAQ** *qarş.* Bir yerə yığışmaq, toplaşmaq. *Uşaqlar topalaşdılar.*

**TOPALDIQAÇ** *is.* İki dəstəyə bölünmüş uşaqların topu ağacla vurmaqla oynadıqları uşaq oyunu. *Topaldıqaç oynamaq.*

**TOPALLAŞMA** "Topallaşmaq"dan *f.is.*

**TOPALLAŞMAQ** *f.* Topal olmaq, qolundan, ya qıçından şikəst olmaq; şikəstləşmək.

**TOPALLIQ** *is*. Bir ayağın, ya qolun o birindən qısa və ya şikəst olması.

**TOPALOTU** *is. bot.* Qılçıqsız və ya kiçik qılçıqlı çoxillik ot bitkisi. *Yanlardan ağarmağa başlayan topalotları və yaşıl pöhrələr dar cığırı örtürdü*. S.Rəhimov.

**TOPALOTUKİMİ(LƏR)** *cəm bot.* Birçiçəkli və ya çoxçiçəkli birillik və çoxillik otların daxil olduğu bitki cinsi.

**TOPASAQQAL(LI)** *sif.* Sıx, qalın saqqalı olan, yekəsaqqal. *Yuxarı başda topasaqqal, qorxunc sifətli, təqribən əlli yaşında bir adam oturmuşdu.* Çəmənzəminli. *Topasaqqal, qırmızıyanaq, dolu, gödəkboy Məşədi Nuru güləgülə dedi.* Ə.Abasov.

**TOPAYARPAQ** *sif. bot.* Yarpaqları topa halında sıx olan. *Topayarpaq bitkilər.*

**TOPAZ** *is.* [*fr.*] Şəffaf kristalları qiymətli daş olan rəngsiz, mavi, çəhrayı mineral.

**TOPBIĞ(LI)** *sif.* Qısa, qalın bığları olan. *Topbığ qoca.*

**TOPÇƏK** *is.* Qurumuş torpaq parçası; kəsək. □ **Topçək vurmaq** – kəsəkləri bellə vurub əzmək, belləmək, təpmək. [Güldanə] *dayanıb fikirləşirdi... Topçək vurub Gülşən kimi və başqa qızlar təkin qan-tərə batsınmı?* Ə.Vəliyev.

**TOPÇİÇƏK(Lİ)** *sif.* Çiçəkləri top şəklində olan. *Topçiçək gül.*

**TOPÇU** *is.* 1. Artilleriya (topçu hissələr) əsgəri. *Keçir uzaqvuran toplar bir alay; Bizim topçulara yoxdur əsla tay!* Ə.Cəmil. *O bizim topçulardır; Göz olur yerə-göyə*. M.Seyidzadə.

2. B a x **artilleriya** 2-ci mənada. *Topçular alayı gəlir arxadan; Fırlanır dolaşıq təkər səsləri*. S.Vurğun. *Qoçəlinin topçu batareyasına yaxınlaşan düşmən tanklarını bir-bir dənləmək əmr olundu*. Ə.Vəliyev.

**TOPÇULUQ** *is.* 1. Topçunun vəzifəsi, işi.

2. B a x **artilleriya** 3-cü mənada.

**TOPDAĞITMAZ** *sif.* 1. Güccatmaz, məğlubedilməz, yenilməz, alınmaz. *El gücü, el köməyi; Topdağıtmaz qaladır.* M.Rahim.

2. *məc.* Çox zəngin, çox varlı, avadanlıqla, qiymətli şeylərlə dolu. [Rüstəm bəy:] *Mən haman Rüstəməm ki, topdağıtmaz Cümşüd bəyin evini xaraba qoydum.* N.Vəzirov. *Dörd otaqdan ibarət, ağzınacan dolu, topdağıtmaz ev-eşik təkcə* [Ağcaya] *qalmışdı*. Mir Cəlal.

**TOPDAN** *zərf* və *sif.* İri partiyalarla, toplarla, taylarla, böyük miqdarda, bütöv-bütöv (*pərakəndə* ziddi). *Topdan və pərakəndə satış.*

**TOPDANSATIŞ** *is.* İri partiyalarla, toplarla, taylarla satış, bütöv taylarla ticarət. *Ağır sənaye məhsulunun topdansatış qiymətlərinin və yükdaşıma tariflərinin aşağı salınması.*

**TOPDANSATIŞÇI** *is.* Malını pərakəndə deyil, topdan satan tacir.

**TOPXANA** *is. köhn.* Artilleriya, toplar, topçu hissələri. [Xəzinədar:] *Gedək əmiritopxananın yanına, onun rəyini dəxi hasil edək*. M.F.Axundzadə.

**TOPQUYRUQ(LU)** *sif.* Qısa, qalın quyruqlu. *Topquyruq qatır. – Qəhrəman çəkinəçəkinə topquyruq atın belinə qalxdı*. S.Rəhimov.

**TOPLADILMA** "Topladılmaq"dan *f.is.*

**TOPLADILMAQ** *məch.* Başqası vasitəsilə toplamaq. *Xırman döyüldü, topladılıb buğda bir yerə*. Ə.Nəzmi.

**TOPLAMA** 1. "Toplamaq"dan *f.is.*

2. B a x **üstəgəl**. *Toplama və çıxma. – Say prosesində təbii olaraq ilk dəfə toplama əməli yaranmışdır*. Z.Xəlilov.

**TOPLAMAQ** 1. B a x **yığmaq** 1, 2, 4 və 6-cı mənalarda. *Uşaqları tapıb, çiyələk, göbələk toplamağa gedirdik.* A.Şaiq. *Sübhanverdizadənin topladığı iki cild material Əbişin zəhri-bağrını yarırdı.* S.Rəhimov.

2. Toplama məqsədilə iki rəqəmi bir-birinin üstünə gəlmək (b a x **toplama** 2-ci mənada). *3 ilə 4-ü toplamaq.*

**TOPLANAN** *is.* və *sif. riyaz.* Toplama əməlində iştirak edən rəqəmlərdən hər biri. *Toplanan rəqəm. Toplananların yerini dəyişdikdə cəm dəyişmir.*

**TOPLANILMA** "Toplanılmaq"dan *f.is.*

**TOPLANILMAQ** *məch.* Başqası vasitəsilə toplamaq; yığılmaq, bir yerə cəm olunmaq. *Bir neçə dəqiqənin içində bütün qaçqınlar toplanıldı.* Ə.Vəliyev. *..Bu cəbhəyə külli miqdarda böyük bombardmançı və qırıcı təyyarə birləşmələri də toplanmışdır.* Ə.Əbülhəsən.

**TOPLANIŞ** *is.* 1. Müəyyən bir iş görmək üçün bir yerə toplaşma, yığılma; toplantı. *Nümayişə toplanış səhər saat 8-də olacaq.*

*– Bu dirəyin ətrafı fəhlələrin toplanış yeridir.* S.Rəhman.

2. Hər hansı bir təşkilat, kollektiv üzvlərinin yığıncağı. *Hər axşam* [klubda] *toplanış olurdu.* S.Hüseyn. [Reyhan:] *Sabah bunu toplanışda; Gərək əzbər söyləyək biz.* M.Dilbazi. // Belə yığıncağın iştirakçıları, üzvləri. *Toplanışın qərarı.*

3. Hərbi mükəlləfiyyətli şəxslərin qısamüddətli təlim üçün hərbi idarənin sərəncamında olması. *Zabitlərin toplanışı. Düşərgə toplanışı.* // Təlim, məşq, təlimat məqsədilə qısa müddətə bir yerdə olma. *Təbliğatçıların toplanışı.*

4. Dərmə, yığma, toplama. *..Bir azdan məhsul toplanışı başlanacaq, iş qızışacaqdır.* S.Rəhimov. *Kəndlərdə məhsul toplanışı qızğın surətdə gedirdi.* Ə.Vəliyev.

**TOPLANMA** "Toplanmaq"dan *f.is.*

**TOPLANMAQ** *f.* 1. Toplaşmaq, yığışmaq, cəmləşmək. *Bayram axşamının gecəsi bütün ailə evə toplanardı.* H.Sarabski. *Bir dəqiqədə arvad-uşaq gəlinin başına toplandı.* Çəmənzəminli.

2. *məch.* Bir yerə, üst-üstə və ya yan-yana yığılmaq, topa, qalaq vurulmaq. *Yığılmış pambıq bir yerə toplandı. – Uca dağların başına toplanmış* (f.sif.) *ağ buludlar pambıq mahlıcına oxşayırdı.* Ə.Vəliyev.

**TOPLANTI** b a x **toplanış** 1 və 2-ci mənalarda. *..Ağaxan bəy kimiləri .. toplantı yeri olan Danzaver kəndinə yığışdı.* S.Rəhimov.

**TOPLAŞDIRILMA** "Toplaşdırılmaq"dan *f.is.*

**TOPLAŞDIRILMAQ** *məch.* Bir yerə cəmləşdirilmək, yığışdırılmaq, toplanmaq.

**TOPLAŞDIRMA** "Toplaşdırmaq"dan *f.is.*

**TOPLAŞDIRMAQ** *f.* Yığışdırmaq, bir yerə yığmaq.

**TOPLAŞMA** "Toplaşmaq"dan *f.is.*

**TOPLAŞMAQ** *f.* 1. Yığışmaq, bir yerə cəmləşmək, toplanmaq. [Mehrəli bəy:] *Biz buraya Əmiraslan ağanın məsləhətilə toplaşmışıq.* S.S.Axundov. [Gülüş Balaşa:] *Mən bura gələrkən qapınızın yaxınlığında bir qadın yıxılmışdı. Kişilər başına toplaşmışdı*(*lar*). C.Cabbarlı.

2. Toplanmaq. *Dağların üstünə toplaşan* (f.sif.) *buludların hər biri bir rəngə çalırdı.* B.Bayramov.

**TOPLATMA** "Toplatmaq"dan *f.is.*

**TOPLATMAQ** *icb.* Başqası vasitəsilə toplamaq, başqasına toplama işi gördürmək; yığdırmaq. *Məhsulu toplatmaq. Taxılı toplatmaq.*

**TOPLAYAN, TOPLAYICI** *sif.* Bir yerə yığan, toplayan; yığıcı.

**TOPLU[1]** *sif.* Topu olan, toplarla silahlanmış. *Qoşunun toplu hissələri.*

**TOPLU[2]** 1. *is.* Bir yerə yığılmış adamlar; dəstə, yığın. *Uşaq toplusu. – Gövhər birdən adam toplusunu gördü, diksindi, bərkdən bir qıy çəkdi.* Ə.Vəliyev.

2. *sif. qram.* Bir tam kimi başa düşülən şeylərin, adamların və s.-nin məcmusunu ifadə edən; ismi-cəm. "*Xalq*" *sözü toplu isimdir.*

3. Məcmuə. "*Qobustan*" *toplusu.*

**TOPLULUQ** *is.* 1. Toplu halda, cəmləşmiş halda olma, toplu şeylərin halı.

2. Bir yerə toplanmış, yığılmış adamlar; toplu.

**TOPLU-TÜFƏNGLİ** b a x **top-tüfəngli**. *Xəlvəti işə girişən şeytan-şuğul kar görməyəndə toplu-tüfəngli padşah qoşunu hərəkətə gəlir, bölük-bölük soldat, dəstə-dəstə qazaq yeriyirdi.* S.Rəhimov.

**TOPÓQRAF** [*yun.*] Topoqrafiya mütəxəssisi (b a x **topoqrafiya** 1-ci mənada).

**TOPOQRAFİK** *sif.* Topoqrafiyaya və ya topoqrafa aid olan, topoqrafiya ilə və ya topoqrafla əlaqədar olan. *Topoqrafik xəritə. Topoqrafik dəstə.*

◊ **Topoqrafik anatomiya** – anatomiyanın, bədən üzvlərinin və hissələrinin qarşılıqlı yerləşməsindən bəhs edən şöbəsi.

**TOPOQRÁFİYA** [*yun.* topos – yer və grapho – yazıram] 1. Geodeziyanın, Yerin forma və ölçüsünü öyrənən və Yer səthinin böyük sahələrini ölçüb planını çəkməklə məşğul olan şöbəsi.

2. Hər hansı bir ölkənin və ya yerin səthinin və onun nöqtələrinin, hissələrinin qarşılıqlı yerləşməsi. *Şəhərin topoqrafiyası.*

**TOPONİMİK** *sif.* Toponimikaya aid olan, toponimika ilə əlaqədar olan. *Toponimik adlar.*

**TOPONÍMİKA** [*yun.*] 1. Hər hansı bir yerin coğrafi adlarının (yaşayış məntəqələrinin, çayların, göllərin və s. adlarının) toplusu.

2. *dilç.* Leksikologiyanın coğrafi adları öyrənən bəhsi.

**TOPONÍMİYA** [*yun.*] b a x **toponimika** 2-ci mənada.

**TOPPUŞ** *sif.* Kök və sağlam; koppuş. *Toppuş uşaq*. – [Elxan] *toppuş ayaqlarını qaldırıb xalçaya endirdi*. S.Rəhimov.

**TOPPUZ** *is.* 1. Başı girdə çomaq, dəyənək. *Teymurun başına yenə də elə bil ağır bir toppuz endirdilər*. H.Seyidbəyli. // Başı bu şəkildə olan. ..*Evin aşağı tərəfində divara söykənmiş başı toppuz çomağını götürüb getdi*. Ə.Abasov.

2. Ucu toxmaqlı zopadan ibarət qədim silah. *Dəmirçioğlu getdi, qılınc, qalxan, cida, gürz, toppuz götürdü, Koroğlunun yanına qayıtdı.* "Koroğlu". [Uluq bəy:] *Döyüşün üz-üzə bir ləzzəti var; Süzməsə göydə qılınc, toppuzlar*. A.Şaiq.

**TOPPUZLAMA** "Toppuzlamaq"dan *f.is.*

**TOPPUZLAMAQ** *f.* Toppuzla vurmaq, toppuzla döymək.

**TOPPUZLU** *sif.* 1. Başında toppuzu olan. *Toppuzlu çomaq*. // Əlində toppuz olan. *Toppuzlu çoban.*

2. *köhn.* Toppuzla silahlanmış. *Toppuzlu pəhləvan*.

**TOPPUZTİKAN** *is. bot.* Kolluq və zibilliklərdə bitən çoxillik ot bitkisi.

**TOPSAQQAL(LI)** b a x **topasaqqal(lı)**. *Topsaqqal kişi*. – [Sadıq] *çox qaradı və kosadı, amma mən ağımtıl və topsaqqalam*. C.Məmmədquluzadə. *Necə Heydərəli? – deyə, Sultan alnını qırışdırdı, topsaqqallı çənəsini qaşımağa başladı*. S.Rəhimov.

**TOP-TOP** *is.* Topla oynanılan uşaq oyunu; kos-kos. *Səhər tezdən böyük bir həvəslə məktəbə axışıb gələn uşaqlar hələ meydançada top-top oynayırdılar.* M.Hüseyn. *Azadım, diqqətlə bax, gəl bu yamyaşıl bağa; Orda top-top oynayan xoşbəxt oğul-uşağa.* S.Rüstəm.

**TOP-TOPXANA** *is.* Artilleriya. *Həm çalınır təbil, kusü nağara; Daldan gəlir top-topxana, qumbara*. A.Səhhət.

**TOP-TÜFƏNG** 1. *top.* Toplar, tüfənglər, odlu silahlar. *Top-tüfəng səsləri batandan bəri; Gəzir qayalarda dağ keçiləri*. S.Vurğun.

2. *məc.* **Top-tüfənglə** şəklində *zərf* – 1) səs-küylə, gurultu ilə, dəm-dəsgahla. [Sultan bəy:] ..*Bir də təzədən top-tüfənglə evlənmək mənə yaraşmaz.* Ü.Hacıbəyov; 2) hədə-qorxu ilə. *Top-tüfənglə üstümüzə gəldilər*. – [Qüdrət Gülbahara:] *Siz içəri gələrkən elə bir top-tüfənglə gəldiniz ki, hamımız özümüzü itirdik*. C.Cabbarlı.

**TOP-TÜFƏNGLİ** *sif.* Top və tüfənglə silahlanmış, odlu silahlı. *Top-tüfəngli dəstə.*

**TOPUQ** *is.* Ayaqda: baldır sümükləri ilə pəncə sümüklərinin birləşdiyi yerdə yanlara çıxan oynaq. *Topuğu ağrımaq. – Avtor əsərinin başlanğıcında yazır ki, qızın uzun saçları topuğuna dəyirdi*. M.Hüseyn.

◊ **Ağlı topuğunda** – gic, ağılsız adam haqqında. **Araz aşığından, Kür topuğundan** – b a x **aşıq**$^2$. **Daldan atılan daş topuğa dəyər** – b a x **dal**. **Dili topuq çalmaq (vurmaq)** – b a x **dil**.

**TOPUQLAMA** "Topuqlamaq"dan *f.is.*

**TOPUQLAMAQ** *f.* Arxadan qovub çatmaq; haqlamaq. *Camışlar evdən uzaqlaşan kimi* [uşaq] *camışları topuqladı.* S.Rəhimov.

**TOPUQLU** *sif.*: **topuqlu başmaq** *köhn.* – uzunboğaz ayaqqabı, boğazlı çəkmə. [Sara xanım:] *Bəlkə sən qurşağa, topuqlu başmağa, yun papağa, büzməli arxalığa etiraz edəcəksən*. Qantəmir.

**TOPUŞ** b a x **toppuş**. *Cavan ana yenə də qırmızıpaltarlı, qıvrımsaçlı, topuş qızını atıb-tutur, ..uşağı güldürür, danışdırırdı.* S.Rəhimov.

**TOR** *is.* 1. Balıq, quş və s. tutmaq üçün ipdən çarpaz toxunaraq bərabər məsafələrdə düyünlə bərkidilmiş alət. *Balıq toru. – Sahibi tor götürüb dənizə gedəndə* [Çupçik] *də sümsünə-sümsünə yortardı*. Mir Cəlal. *Mən yaralı göyərçini tordan çıxarıb* [Eldara] *uzatdım*. M.Rzaquluzadə.

2. Çarpaz toxunmuş ip, məftil və s. ibarət müxtəlif ləvazimat. *Çarpayının toru. Futbol toru.*

3. *dan.* İçinə ərzaq, xırda şey və s. qoyub aparmaq üçün ipdən və s.-dən toxunmuş zənbil, çanta, kisə. *İpək tor. Şeyləri tora qoymaq.* – [Göyərçini] *diri saxlamaq niyyətilə üsulluca tor çantaya salıb Eldarın yanına qayıtdım*. M.Rzaquluzadə.

4. Seyrək toxunmuş köynək, baş yaylığı, pərdə və s. *Sona da indi dönüb bayaqkı ye-*

*rində dayanmış, başından siyrilib çiyninə düşən ağ torunun ipək saçaqları ilə oynayırdı.* Ə.Əbülhəsən. // Tordan hazırlanmış, tor şəklində olan. *Tor köynək. Tor layka. – Pəncərələrdən tor pərdələr sallanırdı.* S.Rəhimov.

5. Hörümçəyin ifraz etdiyi yapışqanlı şirədən əmələ gələn çarpaşıq nazik tellər. *Hörümçək toru.*

6. *məc.* Hiylə, kələk, tədbir, qurğu.

◊ **Tor gənəciyi** *zool.* – b a x **çor**. *Tor gənəciyi, pambıq mənənəsi, pambıq qurdu tarlaların məhsuldarlığını xeyli aşağı salır.* **Tor qurmaq** – 1) quş, balıq və s. tutmaq üçün tor quraşdırmaq və ya suya salmaq. *Ovçu bərədə durub; Bərə üstə tor qurub.* (Bayatı); 2) *məc.* hiylə qurmaq, qurğu qurmaq, kələk düzəltmək. [Əbdül:] *İndi* [Gülnisə] *istəyir ki, yazıq Sara üçün tor qurub, öz qızı Pərini Bəhrama versin.* C.Cabbarlı. **Tora düşmək** – aldanaraq pis işə qoşulmaq, kələyə düşmək, hiyləyə uymaq, tələyə düşmək. *Son zaman Rüstəm kişi oğlunun tora düşməsindən, pis bir günah işləməsindən qorxurdu.* M.İbrahimov. *Amma Göyçək bir gün tora düşəcəyindən qorxurdu.* Ə.Əbülhəsən. **Tora salmaq** – hiylə gəlmək, kələk gəlmək, tələyə salmaq. [Tehrani Ehtişamiyə:] *Bəlkə sən məni tora salmaq istəyirsən, Sərhəng?* Ə.Məmmədxanlı.

**TORAĞAY** *is. zool.* Əsasən səhralarda və çəmənliklərdə yaşayan sərçəkimilər dəstəsindən oxuyan quş. *Qəhqəhə başladı qızılgöz kəklik; Torağay oxudu qalxa-qalxa dik.* H.K.Sanılı.

**TORAN** *is.* 1. Səhər hava işıqlanan və ya axşam hava qaralmağa başlayan vaxt; alaqaranlıq. *Axşam toranı.* – [Kazım] *səhər toranında meşəyə girdi.* M.İbrahimov. ☐ **Toran çağı (vaxtı)** – səhər havanın hələ işıqlanmadığı və ya axşam hələ qaranlıq düşmədiyi vaxt; alaqaranlıq. *Toran çağı bir zorba kişi asta-asta o evə gedir.* S.Rəhimov. **Toran qovuşmaq (qarışmaq, düşmək, çökmək)** – b a x **toranlaşmaq** 1-ci mənada. [Nazlı Ağabəyimə:] *Daha toran qovuşur, evə gedək.* Çəmənzəminli. *Toran qarışıb duman çökəndə Hümmət evinin dalına hərlənib Qarakişini səslədi.* B.Bayramov.

2. *məc.* Qaranlıq, duman. *Neçin gözlərində aləm torandır; Yoxsa əcəl gəlir, axır zamandır?* M.Rahim.

**TORANLAŞMA** "Toranlaşmaq"dan *f.is.*

**TORANLAŞMAQ** *f.* 1. Axşamüstü hava qaralmağa, qaranlıq düşməyə başlamaq, toran qovuşmaq (düşmək, çəkmək).

2. *məc.* Gözü qaralmaq, gözləri dumanlanmaq. *Hüseyn ağlaşma səsini eşidərək toranlaşan* (f.is.) *və yaşla dolan gözlərini silib soruşdu.* S.Rəhman.

**TORANLIQ** *is.* Toran vaxtı (b a x **toran** 1-ci mənada). *Səhər toranlığı.* – [Ağasəfər] *axşam toranlığında çox qəribə görünən, alyaşıl ipək geyimli arvadlara sarı baxıb, Həmzənin arvadı Əminə xanımı işarə ilə yanına çağırmaq istədi.* Ə.Əbülhəsən. *Hürküdür toranlığı; Gülərüzlü günəşin; Odlu qızıl şöləsi.* İ.Səfərli. ☐ **Toranlıq qovuşmaq (düşmək, çökmək)** – b a x **toranlaşmaq** 1-ci mənada. *Bayıra isə yavaş-yavaş axşam toranlığı çökür.* Ə.Əbülhəsən.

**TORBA** *is.* 1. Balaca kisə. [Gülnisə:] *Ana, düyü torbası haradadır?* Ə.Haqverdiyev. [Qəhrəman:] *Özümü pulemyot qoyulan, torpaq doldurulmuş torbanın arxasına yıxdım.* H.Nəzərli. // Minik və ya yük heyvanını dayanacaqlarda yemləmək üçün içinə yem tökülüb boynundan asılan kiçik kisə. *At elin, torba əmanət, bizim daha nəyimiz var?* (Ata. sözü). *Cəmil arpanı xəlbirləyib, atların torbasına tökdü, torbaları atların başına keçirtdi.* Ə.Vəliyev.

2. *dan.* Torba tutan qədər şeyin ağırlığı. *Bu sözlərdən sonra Camal əmi səliqə ilə .. bir torba qovurğa, bir torba iydə yeşiyə qabladı.* Ə.Vəliyev.

3. Bədənin bu və ya başqa bir yerində içinə irin, su, hava və s. yığılmış sallaq şiş, ur, tuluq.

◊ **Boynuna torba salmaq** – dilənçilik etmək, dilənmək. *Axırda tamahkar qarı boynuna torba salıb şəhərə yollandı.* S.Rəhimov.

**TORBACIQ** *is.* Kiçik torba, balaca torba; kisəcik.

**TORBALAMA** "Torbalamaq"dan *f.is.*

**TORBALAMAQ** *f.* Dayanacaqlarda yemləmək üçün minik və ya yük heyvanının başına torba salmaq. *Atı torbalamaq.*

**TORBALI** *sif.* Torbası olan, kisəli; əlində torba, kisə olduğu halda. *Biləklər çirməkli,*

*döşlər önlüklü; Hamısı torbalı, hamısı yüklü.* S.Vurğun.

**TORÇU** *is.* Torla balıq tutan adam. *Bir torçu vardı, həmişə dəryadan balıq tutardı*. (Nağıl).

**TORÇULUQ** *is.* Torçunun işi, peşəsi; balıqçılıq.

**TOREADOR** *is.* [*isp.*] Korridada öküz döyüşünün iştirakçısı.

**TORF** [*alm.*] Çürümüş bataqlıq bitkiləri qalıqlarından əmələ gələn bərk kütlə (yanacaq, gübrə kimi və müxtəlif texniki məqsədlərlə istifadə olunur). *Torf çıxarmaq*.

**TORFLU** *sif.* Torf olan. *Torflu sahə.* // Tərkibində torf olan. *Torflu torpaq. Torflu gübrə*.

**TORFLUQ** *is.* Torf yatağı, torflu bataqlıq, torflu yer. *Torfluqdan istifadə etmək*.

**TORİ** *is.* [*ing.*] İngiltərədə mühafizəkar siyasi partiya.

**TORİT** *is.* Qara, qırmızımtıl, qonur rəngli mineral.

**TORLAMA** "Torlamaq"dan *f.is.*

**TORLAMAQ** *f.* Tor çəkmək, tor vurmaq, torla qapamaq. *Pəncərəni torlamaq.*

**TORLANMA** "Torlanmaq"dan *f.is.*

**TORLANMAQ** *məch.* Tor çəkilmək, torla örtülmək. *Pəncərələr torlanmışdır.*

**TORLU** *sif.* 1. Tor çəkilmiş, torla örtülmüş, tor pərdə asılmış. *Torlu pəncərə*.

2. Tordan düzəldilmiş, tor çəkilmiş, yaxud tor kimi materialdan düzəldilmiş, tor şəklində olan. *Torlu hasarın hündürlüyü ən azı 180 sm olmalıdır.*

◊ **Torlu qişa** *anat.* – göz almasının daxili səthini örtən, işığa çox həssas qişa. *Torlu qişada görmə sinirinin ucları yerləşir.*

**TÓRMOZ** [*yun.*] Hər hansı bir maşının hərəkətini dayandırmaq və ya sürətini azaltmaq üçün qurğu. *Traktorun tormozu. Avtomobilin tormozu. – Qüdrət təmkinlə tormoza keçir.* M.İbrahimov.

**TORMOZÇU** *is. xüs.* Qazıma qurğusunda tormozu idarə edən fəhlə. *Gənc tormozçu kənarda; Qəzetləri yoxlayır.* İ.Səfərli.

**TORMOZLAMA** "Tormozlamaq"dan *f.is.*

**TORMOZLAMAQ** *f.* Tormoz vasitəsilə maşını dayandırmaq və ya sürətini azaltmaq. [Ağa Saleh:] *Adə Musa bəy, qoyma, qoyma. Çarx dönmüş, tormozla, tormozla.* S.S.Axundov. // Öz hərəkətini birdən dayandırmaq və ya azaltmaq. *Maşın birdən tormozladı.* // Ləngitmək, ağırlaşdırmaq.

**TORMOZLANMA** 1. "Tormozlanmaq"dan *f.is.*

2. *is. fiziol.* Qıcıqlandırıcı amilin davamlı təsiri nəticəsində orqanizm toxumalarında qıcıqlanmanın zəifləməsi və ya dayanması; sinir mərkəzlərinin və ya işlək orqanların fəaliyyətinin ləngiməsi. *Tormozlanma mərkəzləri.*

**TORMOZLANMAQ** *məch.* 1. Tormoz vasitəsilə dayandırılmaq və ya sürəti azaldılmaq. *Tormoz pedalını basdıqda təkərlərin dördü də tormozlanır.*

2. *fiziol.* Tormozlanmaya səbəb olmaq (b a x **tormozlanma** 2-ci mənada).

**TORNA** [*ital.*] *tex.* Metal, ağac və s. materialları yonmaq üçün dəzgah; tokar dəzgahı. *Bakıdakı mexaniki zavodlarda təsadüf oluna bilən son sistemli torna, deşmə dəzgahları yan-yana işləyirdi.* Ə.Sadıq.

**TORNAÇI** *is.* Torna dəzgahında işləyən fəhlə; tokar. *Tornaçılar briqadası.*

**TORNAÇILIQ** *is.* Tornaçı peşəsi: tokarlıq.

**TOROS** *is.* Dəniz, çay və göllərdə buz parçaları yığını.

**TORPAQ** *is.* 1. Planetimizin bitki aləminin inkişaf etdiyi üst qatı. *Yer qabığının istilik, rütubət, hava və orqanizmlərin fəaliyyəti təsiri altında dəyişmiş üst qatı torpaq adlanır.* "Ümumi fiziki coğrafiya". // Yer qabığının tərkibinə daxil olan yumşaq, dənəvər, tündqonur rəngli maddə. *Qumlu torpaq. Torpaq yığını. Meşə torpağı. Torpağın məhsuldarlığını artırmaq. – Gözlər qır rəngli torpağa dirənir.* M.İbrahimov. // Torpaqdan olan, torpaqdan düzəldilmiş və ya tikilmiş, döşəməsi quru torpaqdan ibarət olan. *Torpaq yol. – Hənifə balağı haşiyəli tumanı ilə torpaq döşəməni süpürə-süpürə eşiyə yüyürdü*. İ.Hüseynov.

2. Birinin ixtiyarında, istifadəsində olan yer, ərazi, sahə. *Mülkədar torpaqları. – Çox adamın inanmağı gəlmirdi ki, lütün birinə pulsuz-parasız torpaq verələr.* Mir Cəlal.

3. Yer (*göy* qarşılığı). *Səmada, torpaqda düşür qırhaqır, Yerdən alov yağır, göydən od yağır.* M.Rahim.

4. Toz-torpaq. *Biz şəhərə girdiyimiz zaman şiddətli xəzri əsir, küçələrin tozunu havaya sovurur, göydən başımıza torpaq yağırdı.* A.Şaiq.

5. Dövlət, məmləkət, ölkə. *Faşistlərin yuqoslav torpağına hücum etməsi çox oğulları öz yurdundan, ailəsindən ayırdı.* S.Vəliyev.

6. *məc.* Vətən, yurd, el. *Torpağına girsə düşman; Köksün olsun süngü, qalxan!..* A.Şaiq. *Torpağın eşqilə vurur ürəyi; Vətənə bağlıdır qəlbi, diləyi.* M.Rahim.

◊ **Torpağa düşmək** *köhn.* – qabağında diz çökmək, ayağına yıxılmaq. *Gül camalın görüb düşsün torpağa; Bülbülü götürüb əfğanə gəlsin!* Q.Zakir. [Gültəkin:] *Dövlət bəy, aciz bir qadın kimi diz üstündə torpağa düşüb sizə yalvarıram. Məndən uzaqlaşın.* C.Cabbarlı. **Torpağa getmək** – ölmək, vəfat etmək. *Qəflətən Möhsün müəllim xəstələndi və gözlənilmədən bu pak insan torpağa getdi.* S.Rəhimov. **Torpağa (qara torpaqlara) tapşırmaq (gömmək)** – b a x **torpağa təslim etmək**. [Musa:] *Bir dənəcik yavrumu, vərəmli qardaşımı .. bu tək əlimlə qara torpaqlara gömdüm.* H.Cavid. **Torpağa təslim etmək** *tənt.* – basdırmaq, dəfn etmək. *Pərini torpağa təslim edəndən sonra bütün oba... ovçunu da laləli dərənin kənarına qədər ötürdü.* Ə.Məmmədxanlı. **Torpağı qədər (sanı) yaşasın (yaşayasan)** – ölü haqqında danışarkən qarşısındakı adama uzun ömür arzulamaq mənasında işlənir. *Məmmədcəfər də bəzi işlərində* (*torpağı sanı yaşayasınız*) *rəhmətlik dayısı Hacı Səttar bəyə çox oxşayır.* Qantəmir.

**TORPAQALTI** *sif.* Torpağın altında olan; yeraltı. *Torpaqaltı sular. Torpaqaltı sərvətlər.*

**TORPAQARASI** *sif.* Torpağın altında, yerin qatları arasında olan. *Torpaqarası su.*

**TORPAQBASDI** *is.* Keçmiş zamanlarda: hər hansı bir hakimin tabeliyində olan əraziyə ayaq basdıqda adamdan alınan bir növ vergi, rüsum. [Allahqulu:] *Karvan gedir, ..hansı xanın mülkündən keçir, torpaqbasdı alırlar.* Çəmənzəminli.

**TORPAQBƏRKİDƏN** *sif.* Torpağı bərkitmək üçün istifadə edilən. *Torpaqbərkidən maşın. // İs. mənasında.* Torpağı basıb bərkitmək üçün maşın. *Yeni markalı torpaqbərkidən.*

**TORPAQDAŞIYAN** *sif.* Torpaq daşımaqla məşğul olan (fəhlə), torpaq daşımağa məxsus (maşın).

**TORPAQQAZAN** *sif.* Torpaq qazımaqla məşğul olan (fəhlə), torpaq qazımaq üçün istifadə edilən (maşın). *Torpaqqazan maşınların ahəngdar səsləri eşidilir. // İs. mənasında.* Torpaqqazan maşın, torpaqqazan fəhlə. *Müxtəlif peşə sahibi olan yüzlərlə inşaatçı – torpaqqazanlar, betontökənlər, armaturquraşdıranlar və başqaları işə başladılar.*

**TORPAQLAMA** "Torpaqlamaq"dan *f.is.*

**TORPAQLAMAQ** *f.* 1. Üstünü və ya yanlarını torpaqla örtmək. *Çən dolduqdan sonra borunun deşiyini probkalayıb üstünü torpaqlardılar.* H.Sarabski. [Əmiraslan babanın] *calaq vurduğu, qabıq qoyub, hərləmə ilə bağlayıb sarıdığı, kəsik yerlərini torpaqladığı nazik-nazik çubuqlar artıq yeni kök üstündə özlərinə yer etmişdi.* S.Rəhimov.

2. Torpağa basdırmaq, dəfn etmək. *Ölünü torpaqlamaq.*

3. *dan.* Torpaqla sürtüb təmizləmək, yumaq. *Hisli qazanı torpaqlamaq.*

**TORPAQLANMA** "Torpaqlanmaq"dan *f.is.*

**TORPAQLANMAQ** *məch.* 1. Üstü və ya yanları torpaqla örtülmək. *Bütün bostanlarda kartoflular boğaza qədər torpaqlanmışdı.* S.Rəhimov.

2. Torpağa basdırılmaq, dəfn edilmək.

3. *dan.* Torpaqla təmizlənmək, yuyulmaq. *Qablar torpaqlandı.*

**TORPAQLI** *sif.* 1. Torpağı olan, torpaqla örtülmüş. *Eləmi daşlı yerlər; Torpaqlı, daşlı yerlər; Bu dünyada hələ var; Gözləri yaşlı yerlər.* (Bayatı).

2. Torpaq sahibi, torpaq yiyəsi olan, torpağı olan. *Torpaqlı kəndli.*

3. Tozlu. *Gəlir o torpaqlı duman iləri; Tünd olur daha da gəldikdə bəri.* H.K.Sanılı.

**TORPAQÖLÇƏN** *is.* Torpaq sahəsini ölçən və bölən mütəxəssis. *Kolxozun torpaq ölçəni.*

**TORPAQSORAN** *sif.* Güclü nasos vasitəsilə sıyıqlaşdırılmış torpağı çıxarıb bir yerdən başqa yerə vuran. *Kürdə, indi isə Mingəçevir dənizində torpaqsoran maşınlar işləyir.* (Qəzetlərdən). // İs. mənasında. *Torpaqsoranı işə salmaq.*

**TORPAQSIZ** *sif.* Torpağı olmayan. *Torpaqsız kəndli.*

**TORPAQSIZLIQ** *is.* Kənd təsərrüfat işləri aparmaq üçün torpağın çatışmazlığı, torpağın olmaması.

**TORPAQŞÜNAS** *is.* Torpaqşünaslıq mütəxəssisi.

**TORPAQŞÜNASLIQ** *is.* Torpaqları öyrənməklə məşğul olan elm (b a x **torpaq** 1-ci mənada).

**TORPAQÜSTÜ** *sif.* Torpağın üstündə olan; yerüstü. *Bitkinin torpaqüstü hissələri. Torpaqüstü sular.*

**TORPAQYUMŞALDAN** *sif.* Torpağı yumşaltmağa məxsus. *Torpaqyumşaldan maşın.*

**TORPÉD(A)** [*lat.*] Özü hərəkət edən və öz-özünə idarə olunan siqaraoxşar sualtı mərmi. // Torpedlərlə silahlanmış, torpedləri olan. *Torped gəmisi.*

**TORPEDÇİ** *is.* Torped(a) katerində xidmət edən hərbi dənizçi, matros.

**TORPEDDAŞIYAN** *sif.* Torpedlərlə silahlanmış. *Torpeddaşıyan təyyarə.*

**TORPEDLƏMƏ** "Torpedləmək"dən *f.is.*

**TORPEDLƏMƏK** *f.* 1. Torpedlə hücum etmək; torpedlə vurmaq. *Düşmənin sualtı qayığını torpedləmək.*

2. Quyunu genişləndirmək və s. məqsədlər üçün onun içində partlayıcı maddə partlatmaq. *Neft quyusunu torpedləmək.*

**TORŞER** *is.* [*fr.*] Yerdən qoyulan hündür dayaqlı işıqlandırma cihazı.

**TORT** [*ital.*] Yağ, şəkərtozu, yumurta qatılmış xəmirdən hazırlanan şirniyyat məmulatı. *Meyvə tortu. Qozlu tort.*

**TORTA** *is.* Yağ və s. əridilərkən qabın dibinə çökən çöküntü. *Kərə yağın tortası; Qızıl kəmər ortası; Allah muradın versin; Gələn bazar ertəsi.* (Bayatı). [Molla Həmid:] *Sən iki pudu dəxi misin tortasına-zadına çıx, gələn ayın əvvəlində otuz pud gümüş mövcuddur.* M.F.Axundzadə.

**TORTALI** *sif.* Tortası olan, torta verən. *Tortalı yağ.*

**TORVARİ** *sif.* Tora oxşayan, tor kimi.

**TOSQUN** *is.* Dolğun, kök, şişman. *Tosqun kişi. Tosqun adam.*

**TOSQUNLAŞMA** "Tosqunlaşmaq"dan *f.is.*

**TOSQUNLAŞMAQ** *f.* Kökəlmək, bədəncə dolğunlaşmaq.

**TOST** [*ing.*] Süfrə başında birinin ünvanına deyilən xoş arzu, xoş sözlər; bir adamın sağlığına şərab və s. içmək təklifi; sağlıq. [Firidun bəy:] *Mənim tostum var, mən danışan yerdə gərək heç kəsdən səs çıxmasın.* Ə.Haqverdiyev. ☐ **Tost demək** – birinin ünvanına xoş sözlər deyərək sağlığına içməyi təklif etmək, sağlıq demək. [Zakirov Şeydaya:] *Sədəf xanım tost deyəndə sən məclisdə yoxdun.* Ə.Məmmədxanlı. // Bir adamın və ya bir şeyin sağlığına qaldırılan badə. *Birinci tost səbəbkarın sağlığına içildi.*

**TOTAL** *sif.* [*lat.*] Hər şeyi əhatə edən, qavrayış; ümumi.

**TOTALİTÁR** [*fr.* totalitaire, əsli *lat.*] Burjuaziyanın açıq terrorçu diktaturasına əsaslanan; faşist. *Totalitar rejim. Totalitar dövlət.*

**TOTALİTARÍZM** [*fr.* totalitaire *lat.*] Totalitar rejim.

**TOTÉM** [Şimali Amerika hindularının dilindən] Bəzi ibtidai xalqlarda tayfanın əcdadı və himayəçisi sayılıb sitayiş edilən heyvan (bəzən isə bitki və s.). [Çopo:] *Xalq bizi totemləri olan qoçun şərəfinə "mə-ə-ə" deyə mələşərək qarşıladı və ayaqlarımızın altına çiçəklər atdı.* Çəmənzəminli.

**TOTEMİZM** [Şimali Amerika hindularının dilindən] Bəzi ibtidai xalqlarda din forması totemlərə sitayiş.

**TOTUQ** *sif.* Sağlam, kök, koppuş, ətli-canlı. *Totuq gəlinlər bir-bir oynadılar, göyçək qızlar süzdülər.* Çəmənzəminli. *Palıd ağacı tərəfdən pırpız saçlı, qaraşın, totuq bir oğlan uşağı gəldi.* İ.Hüseynov. // Eyni mənada hər hansı bir bədən üzvü haqqında. *Uşaq totuq əlini yanağına söykəyib çoxdan yatmışdı.* Çəmənzəminli. *Atan sənin şəklini; İstəyir məndən, bala; Sabah totuq üzünü; Çəkdirib sallam yola.* S.Rüstəm.

**TOTUQLUQ** *is.* Sağlamlıq, köklük, koppuşluq.

**TOTUŞ** *məh.* b a x **totuq**.

**TOV** *is.* Sığal, sığallama. ☐ **Tov vermək** – sığallamaq, yaraşıq vermək. *Yanağın yanında zülfə tov vermiş; Ucun sancmış tər duvağın üstündən.* M.P.Vaqif.

◊ **Tov tutmaq** – b a x **toy tutmaq** (“**toy**”-da). [Şəhrəbanu xanım:] *Vallah, ona bir tov tutaram ki, gəldiyi yolu da azar, özü də Pariji unudar.* M.F.Axundzadə. **Tova düşmək** – əngələ düşmək, fəlakətə uğramaq, bəlaya düçar olmaq.

**TOVXAN** *is.* Aşıq-aşıq oyununda: aşığın bir üzü – alçı üzün arxa tərəfi. *Aşıq oyununda iki şey var: tovxan və alçı.* Ü.Hacıbəyov.

**TOVLAMA**[1] “Tovlamaq[1]”dan *f.is.*

**TOVLAMA**[2] “Tovlamaq[2]”dan *f.is.*

**TOVLAMAQ**[1] *f.* Tərpətmək, hərəkət etdirmək. [Zamanov] *qol-qılçasını tovlayıb boz atı yortdururdu.* S.Rəhimov. *Hacı istehza ilə əlini tovladı.* Mir Cəlal. // Oynatmaq. [Dəli Həsən:] *Misri qılınclar tovladıq; Dərin dəryalar boyladıq.* “Koroğlu”. *Oğlan dedi əzəmətlə: – Mənim də qüvvətim var; Cəbhələrdə at çaparaq qılıncını tovladı.* N.Xəzri.

**TOVLAMAQ**[2] *f.* Dilə tutmaq; aldatmaq, başdan çıxarmaq, yoldan çıxarmaq. [Süleyman bəy:] *Məni tovlayan çörəkçi Qulunun uşaqları oldular..* Ə.Haqverdiyev. *Nə qədər müəllim* [Tapdığı] *tovladı, müəllimin arvadı onu dilə tutdusa da, heç kəsə qulaq asmadı.* Ə.Vəliyev.

◊ **Başını tovlamaq** – b a x **baş**.

**TOVLANMA** “Tovlanmaq”dan *f.is.*

**TOVLANMAQ** *məch.* Aldadılmaq, yoldan çıxarılmaq.

**TOVLAŞDIRMA** “Tovlaşdırmaq”dan *f.is.*

**TOVLAŞDIRMAQ** b a x **tovlamaq**[2]. [Şəhrəbanu xanım:] *Mən bu saatda Hatəmxan ağanı çağırram, görüm, Müsyö Jordan nəçidir ki, onun qardaşı oğlunu tovlaşdırıb Parijə aparır?* M.F.Axundzadə.

**TOVUZ** *is.* [*ər.*] *zool.* Rəngarəng tükləri və iri yarımdairə şəklində quyruğu olan, Cənubi Asiyada yaşayan iri quş. □ **Tovuz kimi** *məc.* – çox bəzənmiş, bəzənib-düzənmiş, cilvəli gözəl haqqında. *Tovuz kimi xoş bəzənib durubsan; Ala gözə siyah sürmə vurubsan.* Aşıq Ələsgər.

**TOY** *is.* Evlənmə mərasimi, habelə həmin mərasimlə əlaqədar olaraq düzəldilən şənlik, şadlıq məclisi. *Bir yığıncaq gördüm, dedim; Bəlkə toydur, qızlar oynayır?* Ə.Cavad. *Min ölüm xəbəri ürəkdə yandı; Nə bir toya getdik, nə də şadlığa.* S.Vurğun. □ **Toy eləmək (etmək, qurmaq, vurdurmaq, çaldırmaq, tutmaq və s.)** – evlənmə münasibətilə şənlik məclisi düzəltmək. *Qızılgül butam, layla! Ətrinə batam, layla! Balam ərsəyə gələ; Toyunu tutam, layla!* (Bayatı). *Çoban anar səni, tütəyi sızlar; Ellər toy eləməz, yolunu gözlər.* Ə.Cavad. *Tiqran yenicə evlənmişdi. O, kasıb da olsa, toy çaldıranda var-yoxunu əsirgəməmişdi.* M.Hüseyn. [Pərşan:] *Hə, hə, ay nənə, Qaraş qağama bir yaxşı toy quraq!* M.İbrahimov. [Yusif] *qaradonlu Gülbənizi instruktor Məsimə verdi.* [Onlar] *bir cah-calal açdılar, bir toy vurdular ki, bütün rayon tökülüb gəldi.* İ.Hüseynov.

◊ **Toy tutmaq** *məc.* – divan tutmaq, bərk cəzalandırmaq. [Sənəm:] *And olsun Allaha, sənə bir toy tutaram, özünü itirərsən.* Ə.Haqverdiyev. *Sevinc ilə o baxırdı döşündəki nişana; Toy tuturdu yağılara ürəyində qəzəb, kin.* N.Xəzri. **Toydan sonra nağara** – vaxtı keçəndən sonra görülən faydasız bir iş haqqında. *Toydan sonra nağara, – deyə Aslan qımışdı.* Ə.Məmmədxanlı. [Sənubər:] *Kənd camaatı demişkən, toydan sonra nağara?* B.Bayramov.

**TOYBAŞI, TOYBƏYİ** *is.* Toy məclisini idarə edən adam; sərpayı. *Yuxarı başda toybaşı əyləşib.* Ə.Haqverdiyev. [Həsrət:] *Toybəyinin göstərişinə tabe olmaq borcumuzdur.* B.Bayramov.

**TOY-BAYRAM** *is.* Şənlik, şadlıq, bayram; şənlik məclisi, təntənə, toy-düyün, toy, toybüsat. [Qiyas] *toy-bayram adamına bənzəyir.* Mir Cəlal. // *məc.* Xoşbəxtlik mənasında. [Yasəmən:] *Bir yerdə olmaq bizim üçün toy-bayramdır.* S.Rəhman.

**TOY-BÜSAT** b a x **toy-bayram**. *Sağdışı Mələkdi, var toy-büsatı; Anası Nazənin, həmzədir zatı.* Aşıq Ələsgər. □ **Toy-büsat qurmaq** – şənlik etmək, təntənə düzəltmək. *Hər tərəfdə quran toy-büsat mənəm; Ulduzlarla edən ixtilat mənəm.* M.Müşfiq.

**TOYÇU** *is.* Toyda çalan çalğıçı. *Pristav xanımın gileyini başa düşəndən sonra toyçulara çığırdı ki, daha çalmasınlar.* C.Məmmədquluzadə.

**TOY-DÜYÜN** Toy, toy məclisi. // Təntənə, şadyanalıq, şadlıq. *İnandım ki, uzaq deyil, vüsal günüm yaxındır; Arazın o tayında da toy-düyünüm yaxındı.* S.Rüstəm.

**TOYXANA** *is.* Toy məclisi üçün düzəldilən yer, böyük otaq və s. *Həyətdə toyxana özləri tikib, xalı, xalça, palaz, fənər tanış evlərdən yığıb, toyxananı döşərlər.* R.Əfəndiyev. *Toy gecəsinə çox adam gələrdi. Bunun üçün böyük bina olmalı idi. Toyxana köhnə bazarlarda, böyük dükanlarda və geniş tay anbarlarında qurulardı.* H.Sarabski.

**TOY-MAĞAR, TOY-NAĞARA** *is.* Toy büsatı; çalğı, zurna-nağara, zurna-balaban, təntənə. *Məsumu toy-nağara ilə otağa apardılar.* "Məsum". *Fikirli-fikirli susduqca dağlar; Ucalır göylərə toy-mağar səsi.* N.Xəzri.

**TOYPAYI** *is.* 1. Toy hədiyyəsi. [Qız] *anasının aldığı gərdənbəndi xan tərəfindən ancaq toypayı hesab edirdi.* Ə.Haqverdiyev.

2. Keçmişdə: şah, xan sarayında olan toy münasibətilə əhalidən yığılan natural vergi. *Sarayda toy hazırlığı gedirdi: biçilir, tikilir, kəndlərdən toypayı yığılır, gələcək qonaqların siyahısı tutulurdu.* Çəmənzəminli.

**TOYUQ** *is.* 1. Yumurta, tük və ət almaq üçün saxlanan ev quşu. *Ətlik toyuq. Toyuq hini.* // Həmin quşun əti. *Toyuq bişirmək.* // *Sif. mənasında.* Həmin ətdən bişirilmiş, hazırlanmış. *Toyuq kababı. Toyuq şorbası.* – [Mirzə Cəmil] *toyuq çığırtmasından iki tikə ağzına qoyub dayandı və Pərinin danışığının dalına qulaq asdı.* Ə.Vəliyev.

2. *zool.* Toyuqkimilər dəstəsindən olan quşların dişisi. *Qırqovul toyuğu.*

◊ **Toyuq bir qıçlıdır (ki, bir qıçlı)** – dediyi söz səhv də olsa, onun üstündə duran, dediyindən əl çəkməyən, inadkar, tərs adam haqqında. [Qara Kərəmoğlu:] *Kərim bəy tərsin biri idi. Dedi, toyuq bir qıçlıdır, deməli, bir qıçlıdır, daha danışıq ola bilməzdi.* M.İbrahimov. **Toyuq kimi büzüşmək** – soyuqdan, ya qızdırmadan büzüşmək. *Soyuqdan boynunu qısıb toyuq kimi büzüşmüş halda həyətə girdi.* Ə.Abasov. **Toyuq kimi (təki) hinə girmək** – axşam tezdən evə girib qapı-pəncərəni bağlamaq, evdə oturmaq və ya yatmaq. [Camal:] *Əşi, ay Nəbi dayı, indidən niyə toyuq təkin hinə girmisiniz?* Ə.Abasov. **Toyuq ölsə bir çəngə tükdür, dəvə ölsə dərisi bir yükdür** – kiçik şeylə böyük şeyi müqayisə məqamında işlədilir. **Toyuq tara çıxanda (çıxan vaxt)** – hava qaralan vaxt, al qaranlıq olanda, axşam. **Toyuq tardan düşəndə (düşən vaxt)** – hava işıqlaşanda, alaqaranlıqdan, səhər tezdən. *Pambıq zavodunun həyətində, fəhlələrin qapısında toyuqlar tardan düşəndə kəl arabasına beş gözəmə buğda yüklədilər.* Ə.Vəliyev. **Bişmiş toyuğun gülməyi gəlir (tutur)** – mənasız, cəfəng şey və ya söz haqqında. [Asya:] *Elə söz danışırsan ki, bişmiş toyuğun gülməyi tutur.* Ü.Hacıbəyov.

**TOYUQBİTİ** *is. zool.* Əsasən toyuq kimi quşların tükləri arasında yaşayan qansoran xırda parazit.

**TOYUQÇİÇƏYİ** *is. tib.* Keçici uşaq xəstəliyi; suçiçəyi.

**TOYUQÇULUQ** *is.* Quşçuluğun toyuq saxlayıb bəsləməklə məşğul olan sahəsi. *Toyuqçuluğu inkişaf etdirmək.* // Yumurta və ət almaq üçün toyuq, saxlayıb bəsləmə.

**TOYUQKİMİLƏR** *cəm zool.* Qısa və möhkəm dimdiyi, qüvvətli ayaqları olan kəklik, qırqovul, bildirçin və s.-nin daxil olduğu quş dəstəsi.

**TOYUQLU** *sif.* Toyuq ətindən bişirilmiş, toyuq əti olan. *Toyuqlu xəmiraşı.*

**TOYUQPLOV** *is.* Dəmə qoyularkən bütöv bişmiş toyuğu qazanın dibinə qoymaqla bişirilən plov növü. *Varlılar yeddi gün yeddi gecə cibidolu başıboşlara, din dəllallarına toyuqplov verərdilər.* H.Sarabski.

**TOY-VAY** *top.* Toy və ya yas məclisi, hər cür məclis, xeyir-şər. [Qarı:] *Bu abırla elə toya-vaya gedirsən?* S.Rəhimov.

**TOZ** *is.* 1. Hava axını ilə yerdən qalxıb şeylərin üzərinə qonan xırda hissəciklər. *Kömür tozu. Ayaqqabının tozunu silmək.* – *..Marallarım.. moizə kitablarını rəfdən alıb, tozlarını təmizləyib başlayırlar əzbərləməyə.* Ə.Haqverdiyev. *..Maşın dümağ tozun içində gah görünməz olur, gah da irəli şütüyüb toz boğanağını arxada qoyurdu.* B.Bayramov. □ **Toz basmaq** – üzərinə çoxlu toz qonmaq. [Oğlanın] *paltarını, çəkməsini, hətta qıvrım saçlarını belə toz basmışdı.* S.Rəhman. **Tozunu almaq** – tozunu silmək. *Kostyumun tozunu almaq.*

2. B a x **tozcuq**. □ **Toz kisəsi (yuvacığı)** *bot.* – b a x **tozluq**. *Tozluqların iki toz yuvacığı olur.*

3. Bərk cismin narın üyüdülmüş ovuntusu; poroşok. *Diş tozu. Şəkər tozu*. – [Həkim:] *Aptekxanalarda taxtabiti tozu satırlar, get, bir az al, səp yorğan-döşəyin ətrafına*. N.Vəzirov. □ **Toz dərman** – un kimi narın dərman; poroşok.

◊ **Toz qaldırmaq (qoparmaq)** *məc*. – sürətlə getmək, çapmaq, çaparaq getmək. *Kəhər quyruğunu düyüb toz qaldırdı*. M.İbrahimov. **Kosmik toz** – b a x **kosmik**.

**TOZAĞACI** *is. bot*. Ağ qabığı olan yarpaqlı ağac.

**TOZANAQ** *is*. Külək nəticəsində qalxan toz. *Yaman tozanaqdır. – Bakının dəhşətli, gözçıxaran tozanağı hamıya məlumdur*. H.Sarabski. *Külək titrədərdi göyü, yeri də; Tozanaq üstündən bir də tozanaq*. N.Xəzri. // *sif*. Külək nəticəsində çox toz olan, tozanaqlı, tozlu (hava haqqında).

◊ **Tozanaq qaldırmaq (salmaq, qoparmaq)** – təsir etmək üçün yalana zor vermək, gözdən pərdə asmaq.

**TOZANAQLI** *sif*. Çox tozlu, tozla qarışıq. *Bir həftə idi ki, tozanaqlı külək adada bayquş kimi ulayırdı*. Ə.Məmmədxanlı.

**TOZCUQ** *is. bot*. Toxumlu bitkilərin tozluğunda inkişaf edən və hamısı birlikdə toz əmələ gətirən toxumcuqlar şəklində çoxlu xırda mikroskopik törəmələrdən hər biri. *Miçurin müxtəlif armud sortlarının tozcuqlarını bir yerə toplayıb qatışdırdı*. M.Axundov. // Narın toz.

**TOZ-DUMAN** *is*. Havada həm toz, həm də duman olduğu hal; toz və duman. *Kül rəngli havada toz-duman var; Dəhşətli soyuq, ayaz, boran var*. A.Şaiq. *Motorlar Bozdağı yarıb sökdükcə; Toz-duman içindən hara baxırsan?* S.Vurğun.

**TOZGÖTÜRƏN** b a x **tozyığan** 1-ci mənada. *Tozgötürən parça*.

**TOZLAMA** 1. "Tozlamaq"dan *f.is*.

2. *f.is. bot*. Mayalama məqsədilə çiçəyin tozcuğunu erkəkcikdən dişiciyə keçirmə. *Süni tozlama*.

3. *f.is*. Ziyanvericiləri və xəstəlikkeçirici həşəratı məhv etmək üçün bitkiləri zəhərli tozla dərmanlama.

**TOZLAMAQ** *f*. 1. Toza bulamaq, tozlu etmək. *Pencəyi tozlamaq. Paltarını tozlamaq*.

2. Toz qaldırmaq, tozlu etmək. // Toz kimi sovurmaq. *Maşın tərpəndi, dolama yollarla qarı eşə-eşə tozladı*. S.Rəhimov.

3. *bot*. Tozlama aparmaq (b a x **tozlama** 2-ci mənada). *Çiçəyi süni tozlamaq*.

4. Bitkiləri zəhərli tozla dərmanlamaq (b a x **tozlama** 3-cü mənada). *Pambıq sahəsini tozlamaq. Ağacları tozlamaq*.

**TOZLANDIRMA** 1. "Tozlandırmaq"dan *f.is*.

2. B a x **tozlama** 2-ci mənada.

**TOZLANDIRMAQ** b a x **tozlamaq**. *Miçurin bu iki bitkini bir-birilə çarpaz tozlandırmağa başladı*. M.Axundov.

**TOZLANMA** "Tozlanmaq"dan *f.is*.

**TOZLANMAQ** *məch*. 1. Toza bulanmaq, toz basmaq, tozla örtülmək, tozlu olmaq.

2. Tozlama aparılmaq (b a x **tozlama** 2-ci mənada). *Qırmızı yonca cır arıların vasitəsilə tozlanır*. M.Axundov.

3. Zəhərli tozla dərmanlamaq (bitkilər haqqında). *Pambıq sahəsi tozlandı*.

4. Toz halına gəlmək, toza dönmək. *İkicə günün ərzində günəş yolu o qədər qurutmuşdu ki, maşınların təkərinin altından boz torpaq tozlanıb havaya qalxırdı*. M.İbrahimov.

**TOZLANMIŞ** *f.sif*. 1. Toz basmış, toza batmış, üstü tozla örtülmüş, üstünə toz qonmuş. *Üstü-başı gəc ilə tozlanmış ulağı.. gətirdilər*. C.Məmmədquluzadə. *Şərəfoğlu stolun alt gözünü açdı, oradan işlənmədiyi üçün tozlanmış bir külqabı çıxartdı..* M.İbrahimov.

2. *xüs*. Tozlama işi aparılmış (b a x **tozlama** 2 və 3-cü mənalarda). *Tozlanmış tarla*.

**TOZLAYICI** *is. xüs*. Bitkiləri tozlamaq üçün cihaz (b a x **tozlamaq** 4-cü mənada). // Sif. mənasında. *Tozlayıcı əl aparatları*.

**TOZLU** *sif*. Toz basmış, toza bulaşmış, tozlanmış, üstünə toz çökmüş. *Tozlu palto*. – [Fərhad:] *Bu gələn kişilərin tozlu, çirkli ayaqları çox adamın ürəyindən təmizdir*. Ə.Haqverdiyev. *Qoşqar da parusin kostyum geymiş, şalvarının balağını tozlu brezent çəkmənin boğazına salmışdı*. İ.Hüseynov. // Toz, toz-tozanaqlı. *Tozlu hava. – Bu soyuq tozlu gecədə biçarə Məşədi Əsgər adlı bir kişi əli qoynunda o küçədən bu küçəyə, bu küçədən o küçəyə sərgərdan* [gəzib] *balaları üçün ruzi axtarırdı*. S.M.Qənizadə.

**TOZLUQ** *is. bot.* Çiçək erkəkciyinin toz əmələ gələn yuxarı hissəsi; toz kisəsi, toz yuvacığı (b a x **toz** 2-ci mənada). *Çiçək açıldıqdan az sonra tozluqlar partlayır.* "Pambıqçılıq".

**TOZSORAN** *is.* Müxtəlif şeylərin tozunu təmizləmək üçün cihaz; tozyığan. *Yeni markalı tozsoran. Tozsoranla xalçanın tozunu təmizləmək.*

**TOZTƏMİZLƏYƏN, TOZTƏMİZLƏYİCİ** *is.* 1. Küçədə, yolda olan tozu təmizləyən maşın. *Toztəmizləyənlə küçəni təmizləmək.* // Sif. mənasında. *Toztəmizləyən maşın.*

2. B a x **tozsoran**.

**TOZ-TORPAQ** *is.* Toz və torpaq, həm toz, həm də torpaq. *Cana gəldim toz-torpağın əlindən.* M.Müşfiq. [Bulud:] *Çəmənlərdən toz-torpağı silərsən; Yağ, yağışım, al çiçəklər açılsın.* M.Dilbazi.

**TOZ-TORPAQLI** *sif.* Toz və torpaq basmış. *Belə pərakəndəlik, evlərin müxtəlif biçimi, ..yolların toz-torpaqlı olması* [Şahmarı] *darıxdırırdı.* B.Bayramov.

**TOZ-TOZANAQ** *is.* Bərk tozanaq, küləkli-tozlu hava. // Toz, tozanaq. *Külək əsir, qum sovrulur, gözə girir toz-tozanaq; Qoca alim yer altından ayrılmayır hələ ancaq.* S.Vurğun.

**TOZTUTAN, TOZTUTUCU** *is. xüs.* Havanı tozdan təmizləmək üçün cihaz; toztəmizləyən.

**TOZVARİ** *sif.* Toz kimi, un kimi, narın. *Tozvari reagentlər.*

**TOZYIĞAN** 1. *sif.* Tez tozlanan, tozu özündə saxlayan; tozgötürən (parça haqqında).

2. B a x **tozsoran**. *Tozyığanla döşəmənin tozunu silmək.*

**TÖHFƏ** *is.* [*ər.*] Hədiyyə, bəxşiş, ərməğan, pay. [Məhəmməd:] *Bizim eşqimizdən bir xatirətək; Bu kiçik töhfəni alasan gərək.* B.Vahabzadə. // Məc. mənada. [Kərəm:] *Fələk mənim ilə inad eylədi; Qəm ilə hicrandır töhfən, söylədi.* "Əsli və Kərəm".

**TÖHMƏT** *is.* [*ər.*] Danlama, danlayış, məzəmmət, danlaq. *Lətif .. Mərdanovanın ona dikilmiş düşüncəli gözlərində həm özünə qarşı töhmət, həm də böyük qayğı hiss etmişdi.* H.Seyidbəyli. *Sona bu töhmətlərdən yuxuda da can qurtara bilmirdi.* B.Bayramov. ☐ **Töhmət etmək** – danlamaq, məzəmmət etmək. *Mayaya* [Səkinənin] *ürəyi yandı, Rüstəm kişiyə töhmət etdi.* M.İbrahimov. // Birinin hərəkətinə, işə münasibətinə rəsmən verilən mənfi qiymət. *Həmişə tərifnamə arzulayan Kosanın indi töhmət sözündən gözü bərələ qalmışdı.* S.Rəhimov. ☐ **Töhmət almaq** – pis əməlinə və ya işə pis münasibətinə görə töhmətləndirilmək, yazılı və ya şifahi töhmət verilmək. *İşə gecikdiyi üçün töhmət almaq.* **Töhmət vermək** – pis əməlinə görə töhmətləndirmək, yazılı və ya şifahi töhmət vermək. [Sevinc:] *Mahmudla dalaşdığı üçün ona da töhmət verdilər.* Z.Xəlil.

**TÖHMƏTEDİCİ** *sif.* Töhmətli, məzəmmətli; töhmətləndirici, məzəmmətedici, töhmət, məzəmmət ifadə edən. [Yaşlı kişi:] [Şirinnaz] *başını sərzənişlə bulayıb, töhmətedici bir baxışla mənə baxdı.* S.Hüseyn.

**TÖHMƏTLƏNDİRMƏ** "Töhmətləndirmək"dən *f.is.*

**TÖHMƏTLƏNDİRMƏK** *f.* Töhmət etmək, danlamaq, məzəmmət etmək, pisləmək. [Nadir] *..özünü töhmətləndirib, Məcidin hərəkətini haqlı görərək onun evləndiyini ağıllı iş hesab edirdi.* B.Talıblı.

**TÖHMƏTLİ** b a x **töhmətedici**. [Dəlilərin] *töhmətli sözləri Koroğluya dağdan ağır gəlirdi.* "Koroğlu".

**TÖKDÜRMƏK** *icb.* Tökmə işi gördürmək; boşaltdırmaq, tökməyə məcbur etmək. *Dəni kisələrə tökdürmək. Suyu vedrələrə tökdürmək. Qumu maşından yerə tökdürmək.*

**TÖKMƏ** 1. "Tökmək"dən *f.is.*

2. *is. tex.* Əridilib qəlibə tökülmüş metal məmulat. *Polad tökmələr.*

3. *sif.* Tökmə yolu ilə hazırlanmış, qəlibə tökülməklə hazırlanmış. *Tökmə polad. Tökmə dəmir.*

4. *sif.* Öz-özünə əmələ gəlməyib, əl, maşın və s. vasitəsilə düzəldilən. *Tökmə təpə.*

**TÖKMƏBƏDƏN(Lİ)** *sif. dan.* Sağlam, möhkəm, sərrast bədənli. *Gödəkboy, tökməbədən, kürən Daşdəmirin yanaqları yaylaq havasından qıpqırmızı idi.* B.Bayramov.

**TÖKMƏÇİ** *is.* Tökmə işi mütəxəssisi (b a x **tökmə** 2-ci mənada).

**TÖKMƏÇİLİK** *is.* Tökməçinin işi, sənəti, ixtisası.

**TÖKMƏXANA** *is. xüs.* Tökmə üsulu ilə metal məmulat hazırlanan emalatxana, sex.

**TÖKMƏK** *f.* 1. Mayeləri, narın və ya dənəvər halında olan şeyləri olduqları qabdan başqasına və ya başqa yerə boşaltmaq. *Buğdanı anbara tökmək. Odun üstünə su tökmək. – Stol üzərindəki qrafindən stəkana su töküb içdim.* A.Şaiq. *Bəhram makaralarla dama çıxarılan daşı ustasına verir, sement tökürdü.* Mir Cəlal. // Üstündə olan bir şeyi salmaq, düşürmək, atmaq. – *Payızda ağaclar yarpaqlarını tökür. Toyuq tükünü tökdü. – Sitarə ixtiyarsız çiçəkləri əlindən yerə töküb, yenə pəncərənin qabağına çəkilirdi və başını çiyninə qoyub fikrə gedirdi.* Çəmənzəminli. // Ümumiyyətlə, hər hansı şeyi bir yerdən başqa yerə boşaltmaq. *Dam üstündəki kərpicləri yerə tökmək. – Bəziləri toğlubaşı daşlardan töküb, çayın ağzını əkinlərin üzərindən azdırırdılar.* Ə.Vəliyev.

2. Aramsız yağmaq. *Quşbaşı qar hələ də tökürdü.* A.Şaiq. *Yağış sel kimi tökürdü.* S.Rəhimov.

3. Sallandırmaq, sallamaq, salmaq. [Qulu] *seyrək tüklərini darayıb, geniş alnına tökmüşdü, nazik qaşlarının altından baxan xırda gözləri hiylə saçırdı.* Çəmənzəminli. *Tök alnına o avara telləri; Qoy olayım bundan belə sərsəri.* Ə.Cavad.

4. Bir yerə çoxlu adam və ya şey gətirmək, yığmaq. *Balaca Sabirə suyuq olanda Qəhrəman bir göz qırpımında şəhərin həkimlərini evə tökür.* S.Rəhimov.

5. *tex.* Ərimiş metaldan tökmə üsulu ilə məmulat hazırlamaq, detallar istehsal etmək. *Bolt tökmə.* // Tökmə üsulu ilə heykəl hazırlamaq.

6. Bir sıra isimlərdən sonra gələrək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: tədbir tökmək, qan tökmək, qaşqabağını tökmək, acığını tökmək, plan tökmək və s.

**TÖKMƏRƏK** *sif.* Kök, dolğun. *Cavanların arasından çesuça kostyumla lak çəkmə geymiş, saçlı, tökmərək bir oğlan çıxıb irəli gəldi.* Ə.Əbülhəsən.

**TÖKÜB-TÖKÜŞDÜRMƏ** "Töküb-töküşdürmək"dən *f.is.*

**TÖKÜB-TÖKÜŞDÜRMƏK** *f.* Nizamsız, qarışıq halda tökmək, şeyləri ora-bura necə gəldi atmaq. *Evi töküb-töküşdürmək.*

**TÖKÜCÜ** b a x **tökməçi**.

**TÖKÜLMƏ** "Tökülmək"dən *f.is.* [Xəlil:] *Bax, çay hazır, tökülməsi də gənc xanıma həvalə olunur.* Çəmənzəminli.

**TÖKÜLMƏK** *f.* 1. Axmaq, yuxarıdan aşağıya hərəkət etmək (mayelər haqqında). *Budur, böyük bir şəlalənin suyu gurultu ilə axıb tökülür, aşağıda köpüklənərək yayılır.* M.İbrahimov. *Gümüş rəngli çənlərə; Axıb dağ seli kimi; Qara qızıl tökülür.* İ.Səfərli. // Düşmək (səpələnən, dənəvər, ya xırda şeylər haqqında). *Tavanın suvağı tökülür. Buğda kisədən tökülür. Torpaq başımıza tökülür.* // Düşmək, yerindən çıxıb düşmək. *Dişləri tökülmək. Saçı tökülmək.*

2. Axmaq, süzülmək, dammaq, sızmaq. *Göz yaşı tökülmək. – Cəlal qaranlığa sıxdı naqanı; Töküldü yəhərə Gərayın qanı.* S.Vurğun. [Səlim] *o qədər odlu danışırdı ki, tər başından üzünə, boyun-boğazına sızıb tökülürdü.* Ə.Vəliyev.

3. *dan.* Şiddətlə, aramsız gəlmək, yağmaq. *Qar ara vermədən tökülür.* // *məc.* Yağmaq, gəlmək, enmək, saçmaq. *Yunis çöl istisinin şiddətini ancaq indi hiss edirdi, göydən od tökülürdü.* Mir Cəlal. *Buludlarda şığıyan şimşəklərdən yerə tökülən* (f.sif.) *qığılcımlar hər tərəfi çulğayan bir yanğına çevrilir.* M.Rzaquluzadə.

4. Dənizə, gölə və ya başqa çaya axmaq, onunla birləşmək, qovuşmaq (çay haqqında). *Araz Kürə tökülür. Volqa çayı Xəzər dənizinə tökülür. – Cüt axıb tökülür çaylar ümmana; Uca-uca dağlar lap baş-başadır.* N.Rəfibəyli.

5. Kütlə və ya izdiham halında çıxmaq, gəlmək, getmək, axışıb gəlmək, tökülüşmək. *Bunların çığırtısına hər iki məhəllədən adamlar töküldülər.* N.Nərimanov. *Uşaqdan böyüyə, qarıdan qocaya hər kəs ünləşib, Cavanşir qəsəbəsinin küçələrinə tökülmüşdü.* S.Rəhimov. // Eyni mənada heyvanlar haqqında. *Gəlsin bahar fəsli, açılsın yazlar; Göllərə tökülsün ağ qular, qazlar.* Qurbani. *Gün çeşt yerinə qalxanda ilxı kəndə töküldü.* Ə.Vəliyev. ☐ **Üstünə tökülmək** – üstünə hücum etmək, tökülüşmək. *Köpəklər* [Qumrugilin] *üstünə töküldü.* Mir Cəlal.

6. Düşmək, enmək, tökülüşmək. *Sərnişinlər qatardan tökülürdülər. – Təpədə, tarlada qatırçılar qatırdan töküldülər.* Mir Cəlal.

7. Sallanmaq, düşmək. *Saçı üzünə tökülmək.* – [Abbas:] *Dal gərdənə tökülübdü hörmələr; Mina gərdən, incə beli bürmələr.* "Abbas və Gülgəz".

8. Yerindən qopub, yaxud sınıb, xarab olub düşmək; uçulmaq. *Divarın suvağı töküldü.* – *Deşilir pəncərə, tökülür şüşə; Partıltı səsinə səs verir meşə.* H.K.Sanılı.

9. *məc.* Köhnəlib yıpranmaq, yararsız hala gəlmək. *Uşaqlar cirə ilə yaşamaqdan və soyuqdan sapsarı olmuşdular. Üst-başları da tökülmüşdü.* M.İbrahimov.

10. *məc.* Yağmaq. *Hər tərəfdən güllə tökülür.* – *İnsan düşünməyə tapmayır macal; Tökülür meydana bomba dalbadal.* M.Rahim.

11. Çıxmaq, düşmək (dişlər haqqında). *Ağzında bütün dişləri tökülüb.* – *Qabaq dişim tökülüb; Azılarım sökülüb; Mənə qoca deməzlər; Bir az belim bükülüb.* M.Ə.Sabir.

12. İfadə etmək, görünmək, görsənmək, bilinmək. [Sarxan] *gözlərindən hiyləgərlik tökülən* (f.sif.) *alman əsgərinin üstünə təpindi.* M.Hüseyn. *Yerli camaata oxşamır qonaq; Doğmalıq tökülür üzündən ancaq.* B.Vahabzadə.

13. Gəlmək (çoxlu şey haqqında). "*Molla Nəsrəddin*" *idarəsinə hər yerdən və hər tərəfdən gündə əlli-altmış məktub töküldü.* C.Məmmədquluzadə.

14. Yorğunluqdan, ya soyuqdan üzülmək, ağrımaq, sızıldamaq. [Bahar:] *Ayaqlarım tökülür, qatığı satdım üç abbası bir şahıya.* Ə.Haqverdiyev.

15. "Tökmək"dən (1 və 5-ci mənalarda) *məch. Çəpərlər aradan bir-bir sökülsün; Palçıqlı yollara çınqıl tökülsün.* S.Vurğun. *Evin ortasına çoxlu yorğan-döşək yunu, balış tükü tökülmüşdü.* Ə.Vəliyev. *Dəvələr dal həyətdə boşalıb, taxıl elə dəvəçilərin köməyi ilə də anbara tökülmüşdü.* Ə.Əbülhəsən.

**TÖKÜLÜŞMƏ** "Tökülüşmək"dən *f.is.*

**TÖKÜLÜŞMƏK** b a x **tökülmək** 5 və 6-cı mənalarda. *Uşaqlar qatardan bir-bir tökülüşdü.* S.Rəhimov. *Qonşular tökülüşüb, anabalanı kiridirdilər.* Mir Cəlal. ☐ **Üstünə tökülüşmək** – üstünə hücum etmək, yerbəyerdən hücum etmək (çoxları haqqında). *Aşağı məhəllənin itləri hürüşüb Tahirin üstünə tökülüşdülər.* M.Hüseyn.

**TÖKÜNTÜ** b a x **tullantı**. *Mədəndən əla daş da çıxır, töküntü də.* Mir Cəlal. // Bir şeyin işləndikdən, yeyildikdən sonra artıq qalan hissəsi; qalıq. *Süfrə töküntüsü.*

**TÖKÜŞDÜRMƏ** "Töküşdürmək"dən *f.is.*

**TÖKÜŞDÜRMƏK** *f.* Nizamsız, səliqəsiz halda tökmək, qoymaq, dağıtmaq. *Şeyləri töküşdürmək.* – *Polislər evi töküşdürməyə, yorğan-döşəyi sökməyə, uzun şişlərlə divarları belə deşməyə başladılar.* Mir Cəlal.

**TÖRƏ** *sif. məh.* Hündür olmayan, yastı, kiçik. *Törə ağac.*

**TÖRƏBOY** *sif. məh.* Boyu törə, bəstəboy, alçaqboy. *Boz şaldan pencək-şalvar geyinmiş, şirvani çarıqlı, törəboy, çatmaqaş uşaq madyanı kənara çəkdi.* Ə.Abasov.

**TÖRƏDİCİ** *is.* 1. *k.t.* Nəsil törədən erkək. *Qabaqcıl fermaların təcrübəsi geniş yayılır, ..cins inək və törədicilərin gətirilməsinə fikir verilir.* (Qəzetlərdən). // Sif. mənasında. *Törədici merinos qoçu.*

2. Bir prosesi əmələ gətirən, törədən, törəməsinə səbəb olan mikrob və s. *Xəstəlik törədicisi.*

**TÖRƏDİLMƏ** "Törədilmək"dən *f.is.*

**TÖRƏDİLMƏK** *məch.* Yaradılmaq, meydana gətirilmək, vücuda gətirilmək.

**TÖRƏMƏ** 1. "Törəmək"dən *f.is.*

2. *is.* Nəsil. [Mirzə Cəmil:] *Böyük bir törəmənin içində vur-tut fərasətlisi ortancıl əmimin oğlu idi ki, fələk əlimdən aldı.* Ə.Vəliyev. // Övlad, nəvə-nəticə, oğul-uşaq. [Əmiraslan:] *..Buradakıların çoxu elə mənim öz törəməm deyilmi, arvad?* S.Rəhimov. [Hümmət Şahmara:] *Bəs deyirlər, ot kökü üstə bitər, Əsəd kimi adamdan belə törəmə?* B.Bayramov.

3. Hər hansı bir proses nəticəsində törəyən, əmələ gələn şey. *Dağ törəmələri.* – *Torpaq əmələgəlmə prosesi nəticəsində* [boz torpaqlarda] *yeni karbonatlı törəmələr az müşahidə olunur.* "Qarabağ düzünün torpaqları". // Bir şeydə əmələ gəlmiş, törəmiş yeni ünsür, forma və s. *Ciyərdə yeni törəmələr. Dilin lüğət tərkibində yeni törəmələr. // Sif. mənasında.* Özünə bənzər şeydən əmələ gəlmiş, törəmiş. *Törəmə söz. Törəmə kəmiyyət.*

**TÖRƏMƏK** *f.* 1. Əmələ gəlmək, baş vermək, meydana gəlmək, vücuda gəlmək, doğmaq. *Kürdüstan dağlarında başlənmiş bu iki*

*çiçək .. digər tərəfdən nifaqa və ondan törəyən* (f.sif.) *faciəli hadisələrə də səbəb oldu*. S.S.Axundov. *Həngamə ondan törəmişdi ki, Bəndalı gəlib bura çıxmışdı*. Mir Cəlal.

2. Doğulmaq, dünyaya gəlmək. *..Hacı Yusif və Molla Nəsrəddin Molla Sədrəddin əmioğlunun əmioğlanları və qohumlarıdır və bir atadan və bir anadan törəyənlərdir*. C.Məmmədquluzadə. [Qartal:] *Böyük sərkərdəm Cavanşirdən belə xain övlad törəyə bilməz*. M.Hüseyn.

3. Nəsli artmaq, çoxalmaq, törəyib-artmaq, doğub-törəmək. [Muradın] *müəyyən bir planı da vardı, toyuqlarını çoxaldacaq, keçiləri doğub-törəyəcək, keçən payızda aldığı düyəsi gələn il bala verəcəkdi*. S.Hüseyn.

**TÖRƏNƏCƏK** *is.* Əmələgəlmə, törəmə, yaranma; törədən amil, törədən səbəb, zəminə *..Bu arzuya vasil olmaq ancaq o vaxt mümkün olar ki, əşar və asarın törənəcək yeri hissiyyat ola..* F.Köçərli.

**TÖRƏNİŞ** *is.* Törənmə, əmələ gəlmə.

**TÖRƏNMƏ** "Törənmək"dən *f.is.*

**TÖRƏNMƏK** bax **törəmək**. *Səndən törənibdir bizim evdə belə bidət*. M.Ə.Sabir.

**TÖRƏTMƏ** "Törətmək"dən *f.is.*

**TÖRƏTMƏK** *f.* 1. Əmələ gətirmək, yaratmaq, meydana gətirmək, doğurmaq, baş verməsinə, törəməsinə səbəb olmaq. [Həyat:] *..Bütün bu narazılığı törədən* (f.sif.) *səbəbləri aradan qaldırarıq*. M.İbrahimov. *Bu qanlı, qorxunc işi; Kimlər idi törədən?* Ə.Cavad.

2. Nəsil artırmaq, dünyaya gətirmək, törədib-artırmaq. [Rüstəm bəy:] *Yaranmışlar müəyyən yaşa çatıb törətmək qabiliyyəti duyar-duymaz hiss onları idarə etməyə başlayır*. Çəmənzəminli.

**TÖRPÜ** *is.* Müxtəlif formalarda olan iridişli yeyə növü. *Törpü ilə dəmiri yonmaq.*

**TÖRPÜDƏYMƏMİŞ, TÖRPÜGÖRMƏMİŞ** *sif.* və *is.* Kobud, qanmaz, yontalanmamış. [Sədr:] *Əziz kimi özündən bədgüman və törpüdəyməmişlərlə mübarizəmiz hələ qabaqdadır.* Ə.Vəliyev.

**TÖRPÜLƏMƏ** "Törpüləmək"dən *f.is.*

**TÖRPÜLƏMƏK** *f.* Törpü ilə yonmaq; yeyələmək.

**TÖR-TÖKÜNTÜ** *is.* 1. Bax **qalıq** 1-ci mənada. *Qurban boşalmış içki şüşələrini, yeyilmiş qəlyanaltının tör-töküntüsünü süfrədən yığdı.* T.Ş.Simurq.

2. *məc.* Məhv olmuş ictimai quruluşun mənfi qalıqları, izi; cəmiyyətin mənən pozulmuş ünsürləri. [Mürşüd:] *İnci, axı o gün mən sənə isbat elədim ki, qısqanclıq kapitalizmin tör-töküntüsüdür*. S.Rəhman.

3. *top.* Səliqəsiz halda yerə tökülmüş şeylər, qarmaqarışıqlıq haqqında. *Gülzar yığışdırır tör-töküntünü; Sonra da həyatdə çırpır örtünü*. S.Vurğun. *Ev tör-töküntü idi. Xanım Balacayeva arada eşələnir və Gülöyşə ilə danışırdı.* S.Rəhimov.

**TÖR-TÖKÜNTÜLÜ** *sif.* Səliqəsiz, qarmaqarışıq, tör-töküntü olan. *Azacıq sonra Həmzə zinətli, amma tör-töküntülü otağın yuxarı başında dayandı.* Ə.Əbülhəsən.

**TÖR-TÖKÜNTÜLÜK** *is.* Tör-töküntülü yerin halı; səliqəsizlik, qarmaqarışıqlıq.

**TÖSBƏRƏK** *sif.* Qısaboylu, gödək.

**TÖVBƏ** *is.* [*ər.*] Etdiyi pis əməldən peşman olub bu işi daha etməyəcəyinə söz vermə, əhd etmə. [Camaat:] [Hacının] *tövbəsi bizə lazım deyil*. Ə.Haqverdiyev. // Bəzən nida məqamında işlənir. [Tarverdi:] *Vay aman, qələt elərəm, quldurluğa dəxi çıxmanam, heç kimi soymanam, tövbə, tövbə!* M.F.Axundzadə. // *din.* Günah və qəbahətlərindən əl çəkib, Allaha üz tutaraq bir daha etməyəcəyinə söz vermə. [Xanım] *..qarşısında sönük işıq yanan İsanın təsvirinə yanaşdı, dizi üstə düşüb tövbəyə başladı.* Çəmənzəminli. ☐ **Tövbə etmək (qılmaq)** – 1) *din.* günahlarından peşman olub, bir daha onları təkrar etməyəcəyinə söz vermək, and içmək: 2) təqsirlərini boynuna alıb, daha təkrar etməyəcəyinə söz vermək, and içmək. *Ənvər yalvarıb-yaxardı. Müşkünazın qarşısında diz çöküb dil çıxartdı. Tövbə eləyib üzr istədi*. Ə.Vəliyev. [Ehtişami Azərə:] *Son dəfə təklif edirəm, tövbə et, Azər, tövbə etsən, boş vəzir özü bura gəlib, günahından keçəcək!* Ə.Məmmədxanlı; 3) tərgitmək, əl çəkmək. *Mən qumarı tövbə etmişəm*. S.S.Axundov.

**TÖVBƏLƏTMƏ** *is.*: **tövbələtmə (tövbələtmə dərsi) vermək** – pis işi bir daha təkrar etməmək üçün birini tənbeh etmək, cəzalandırmaq, qulaqburması vermək. [Hacı Qara:] *Hamısına tövbələtmə verrəm ki, dəxi heç*

*qaçaqçının qabağın kəsməsinlər.* M.F.Axundzadə. [Nəriman Sahibə:] *Mən də dedim ki, gəlin birləşək, birdəfəlik tövbələtmə dərsi verək.* M.İbrahimov.

**TÖVBƏLİ** *sif.* Tövbə etmək, bir işi görməyəcəyinə and içmiş, söz vermiş andlı. *O vaxtdan indiyə kimi Sevdim mollaxana ilə arvada tövbəlidir.* Ə.Vəliyev.

**TÖVHİD** *is.* [*ər.*] 1. Bir neçə şeyi birləşdirmə.

2. Allahın birliyinə, vahid olmasına inam.

**TÖVLƏ** *is.* At, inək və s. ev heyvanlarının saxlandığı bina. *İmarətin sol tərəfində tövlələr, anbarlar, mərəklər tikilmişdi.* Çəmənzəminli. *Bu zaman Nəriman əmi tövlədən yedəyində bir qaşqa ürkə çıxarıb ağaca bağladı.* İ.Əfəndiyev.

**TÖVRAT** *is.* [*qəd. yəh.* tora] Yəhudilərin müqəddəs dini kitabı. Bibliyanın (İncil) ilk beş kitabıdır. Əhdi-ətiqə daxildir.

**TÖVSİF** *is.* [*ər.*] Tanıtma, xüsusiyyətlərini açıqlama.

**TÖVSİYƏ** *is.* [*ər.*] 1. Necə hərəkət etmək, bir işi necə görmək haqqında təklif, məsləhət, tapşırıq. [Mehriban] *keçən gün* [Səlimin] *tövsiyələrini diqqətlə dinləmiş, onu vağzaladək müşayiət belə etmişdi.* S.Hüseyn. [Mələk xanım Mehmana:] *Mənim sənə analıq tövsiyəm vardır.* S.Rəhimov.

2. Yaxşı rəy.

◊ **Tövsiyə etmək (eləmək)** – 1) məsləhət vermək, məsləhət görmək, arzu etmək, təklif etmək. [Şahin:] *Müəllim and verdi*, [saatı] *əbədi saxlamağımı tövsiyə elədi.* B.Bayramov; 2) bir işə yaxşı rəy vermək.

**TÖVŞÜK** *is.* Tövşümək işi, tövşümə. □ **Tövşüyünü almaq** – nəfəsini dərmək, dərindən nəfəs almaq. *Kəngərli gözlərini yerə zilləyib tövşüyünü aldı.* Ə.Vəliyev.

**TÖVŞÜMƏ** 1. "Tövşümək"dən *f.is.* [Ninanın] *həyəcan və iztirabı köksünün döyünməsindən və tövşüməsindən bəlli olurdu.* M.S.Ordubadi.

2. Təngnəfəslik. *Yenə tövşüməm tutdu.*

**TÖVŞÜMƏK** *f.* Çətinliklə nəfəs almaq, təngnəfəs olmaq, nəfəsi təngləşmək. *Dağı birnəfəsə qalxıb aşan kəs; Tövşüdü qalxanda pilləkənləri.* N.Xəzri. *Gün altında tövşüyür; Qara kəl, təpəl öküz.* H.Hüseynzadə.

**TÖYCÜ** *is.* Keçmişdə: kəndlilərdən alınan vergilərdən biri (vergini və ya ümumi borcu ödəmək üçün camaatdan yığılan pul və s.). [Allahverdi:] *..Bildirki töycünün altından çıxa bilmirdik, indi də dinməver gəlib.* C.Cabbarlı.

**TRAFARÉT** [*ital.* traforetta – deşilmiş] 1. Bir şeyə köçürülməli olan şəkil və ya yazı nümunəsi kəsilmiş nazik lövhə. *Naxışlı trafaret.* // Belə lövhənin (lövhəciyin) vasitəsilə alınan şəkil, yazı.

2. Basmaqəlib, şablon.

**TRAGEDİYA** [*yun.* tragoedia] 1. Əsasını barışmaz həyat konfliktləri, xarakter və ehtirasların kəskin toqquşması təşkil edən və adətən qəhrəmanının ölümü ilə nəticələnən dramatik əsər; faciə. *Şekspirin tragediyaları.* "*Şeyx Sənan*" *tragediyası.*

2. *məc.* Çox acı, dəhşətli hadisə; bədbəxtlik, faciə.

**TRÁGİK¹** [*yun.* tragikos] Tragik (faciəvi) rollar ifa edən artist; faciə artisti. *H.Ərəblinski Azərbaycanın məşhur tragikidir.*

**TRAGÍK²** 1. "Tragediya"dan *sif.* *Tragik janr. Tragik artist.*

2. Faciəli. *Tragik mənzərə.*

**TRAGİKOMÉDİYA** [*yun.* tragoedia və *ital.* commedia] Həm tragik, həm də komik ünsürləri özündə birləşdirən dramatik əsər.

**TRAGÍZM** [*yun.*] Dramatik və musiqi əsərində və ya onun ifasında faciə ünsürü; faciəlilik. *Süjetin tragizmi. Surətin tragizmi.*

**TRAXEYA** *is.* [*yun.*] Boğaz, nəfəs yolu.

**TRAXÓMA** [*yun.* trachys – kələ-kötür] *tib.* Göz konyuktivinin keçici xronik xəstəliyi.

**TRAXOMALI** *sif.* Traxoması olan, traxoma olmuş. *Traxomalı göz.*

**TRAKTÁT** [*lat.* tractaus – müzakirə] 1. Ayrıca bir məsələdən, problemdən bəhs edən elmi əsər. *Fəlsəfi traktat. Əbu Əli ibn Sinanın* "*Qanun*" *traktatı.*

2. *dip.* Beynəlxalq müqavilə, saziş, bağlaşma.

**TRÁKTOR** [*ing.*] Kənd təsərrüfatı alətlərini və başqa alətləri çəkib aparmaq üçün özüyeriyən maşın. *Tırtıllı traktor.* – *Çöldə traktorun səsi canlanır; Obalar şənlənir, həyəcanlanır.* S.Vurğun. *Heybətin traktoru guruldamağa başladı.* M.Hüseyn.

**TRAKTORÇU** *is.* Traktor sürücüsü. *Traktorçu sürüb gəldiyi sahələrin yaşıl bitkilərinə, kollu məhsuluna baxanda da ləzzət duymalıdır.* M.İbrahimov. *Yarışır yer şumlayan cavan traktorçular.* Ə.Cəmil.

**TRAKTORÇULUQ** *is.* Traktorçunun işi, peşəsi, sənəti.

**TRAKTORLAŞDIRILMA** "Traktorlaşdırılmaq"dan *f.is. Kənd təsərrüfatının traktorlaşdırılması.*

**TRAKTORLAŞDIRILMAQ** *məch.* Xalq təsərrüfatının hər hansı bir sahəsində traktorlar, traktor dartı qüvvəsi tətbiq edilmək.

**TRAKTORLAŞDIRMA** "Traktorlaşdırmaq"dan *f.is. Traktorlaşdırma tədbirləri.*

**TRAKTORLAŞDIRMAQ** *f.* Xalq təsərrüfatının hər hansı bir sahəsində traktorlar, traktor dartı qüvvəsi tətbiq etmək.

**TRAKTÓVKA** [*rus.*] Şərh, izah. *Pyesin rejissor traktovkası.*

**TRAL** *is.* [*ing.*] Balıq ovlamaq üçün iri tor.

**TRAMPLÍN** [*fr.* tremplin] 1. Tullanarkən adamı itələyən və tullanılan məsafənin uzunluğunu və ya hündürlüyünü artırmağa kömək edən xüsusi qurğu. *Tramplindən suya tullanma. Xizək tramplini.*

2. *məc.* Hər hansı bir işə başlamaq üçün dayaq, çıxış nöqtəsi; istinadgah.

**TRAMVÁY** [*ing.*] 1. Yerüstü relsli şəhər elektrik nəqliyyat növü.

2. Bir və ya bir neçə vaqondan ibarət qatar. *Tramvaya minmək. – İndi tramvay daha enli bir küçə ilə gedirdi.* M.Hüseyn.

3. Canlı dildə bəzən şəhərətrafı elektrik dəmir yoluna və onun qatarına verilən ad. *Gəl minək tramvaya, gedək bir Buzovnaya; Bir heykələ bənzəyir sahilində hər qaya.* S.Rüstəm.

◊ **Çay tramvayı** – şəhər dairəsində çayda hərəkət edən kiçik sərnişin gəmisi və ya kateri.

**TRAMVAYÇI** 1. Tramvay işçisi. // Tramvay parkının çilingəri.

2. Tramvaysürən. *Tramvayçılar zəngi daha da bərk vurur*(*lar*). Mir Cəlal.

**TRAMVAYSÜRƏN** *is.* Tramvay maşinisti, tramvay sürən adam; tramvayçı.

**TRANSFER** *is.* [*ing.*] Yer, iş dəyişmək, idmanda bir komandadan başqasına keçmək.

**TRANSFORMÁSİYA** [*lat.* transformatio] 1. *kit.* Bir şeyin öz şəklini dəyişməsi, başqa şəklə düşməsi, bir haldan başqa hala keçməsi; dəyişmə, dəyişilmə. *Hava kütləsinin transformasiyası. İşığın transformasiyası.*

2. *fiz.* Elektrik cərəyanının transformator vasitəsilə dəyişməsi.

3. Aktyorun öz zahiri görkəmini (kostyumunu, qrimini, parikini və s.) cəld dəyişməsi əsasında qurulan teatr və ya sirk nömrəsi.

**TRANSFORMÁTOR** [*lat.* transformare – dəyişmə] Dəyişən elektrik cərəyanının gərginliyini artırmaq və ya azaltmaq üçün aparat.

**TRANSKRÍPSİYA** [*lat.* transcriptio – üzünü köçürmə] 1. *dilç.* Hər hansı bir dilin, qrafik və orfoqrafik normalarından asılı olmayaraq, bütün incəliklərinin mümkün qədər dəqiq verilməsi üçün tətbiq edilən yazı, ya işarələr sistemi. *Fonetik transkripsiya. Dialektoloji materiallarda transkripsiya tətbiq etmək.*

2. Bax **transliterasiya**. *Fars sözlərinin Azərbaycan hərfləri ilə transkripsiyası.*

3. *mus.* Bir alət və ya səs üçün yazılmış musiqi əsərinin başqa alətdə və ya səslə ifa etmək üçün uyğunlaşdırılması. *Simfonik əsərin fortepiano üçün transkripsiyası.*

**TRANSLİTERÁSİYA** [*lat.* trans – vasitəsilə və littera – hərf] *dilç.* Bir əlifbanın hərflərinin başqa əlifbanın hərfləri ilə verilməsi.

**TRANSLYÁSİYA** [*lat.* translatio – verilişdən] 1. Səs, musiqi, təsvir və s.-nin radio, televiziya və ya məftil vasitəsilə uzaqlara verilməsi; veriliş. *Teatrdan operanın translyasiyası. Stadiondan futbol matçının translyasiyası.*

2. *dan.* Bu üsulla verilən veriliş. *Translyasiyaya baxmaq.*

**TRANSMÍSSİYA** *is.* [*lat.*] Fırlanma hərəkətini mühərrikdən enerji istehlakçılarına – işlək maşınlara ötürən qurğu və ya sistem.

**TRANSPARÁNT** *is.* [*fr.*] Yazının təmiz kağızda düzxətli alınması üçün onun altına qoyulan tünd xətlərlə cizgilənmiş vərəq; şüarlar yazılmış çeşidli lövhələr.

**TRANSPORTYOR** *is.* [*fr.*] 1. Konveyer.

2. Qarajda avtomobilin yerini dəyişdirmə qurğusu.

3. Nəqliyyat işləri ilə məşğul olan.

**TRANŞEY** *is.* [*fr.*] 1. *hərb.* Səngər.

2. Karxana.

3. Uzun xəndək, qanov.

**TRANZÍSTOR** [*ing.*] Elektrik siqnallarını gücləndirmək üçün yarımkeçirici cihaz (radiotexnikada, elektronikada çox vaxt elektron lampalarının əvəzinə işlədilir). // Həmin prinsip əsasında işləyən portativ radioaparat.

**TRANZİSTORLU** *sif.* Tranzistoru olan, tranzistorla işləyən. *Tranzistorlu radiocihaz.*

**TRANZÍT** [*lat.* transitus – keçid] Yolda üçüncü bir ölkədən keçməklə, bir ölkədən digərinə və ya aralıq məntəqələrdən keçməklə bir məntəqədən digərinə yük və ya sərnişin daşıma. // Tranzit qaydası ilə həyata keçirilən. *Tranzit ticarət. Tranzit yükdaşıma.* // Təyin olunmuş yerinə qədər tranzit qaydası ilə daşınan; tranzit qaydası ilə gedən. *Tranzit vaqon.* // Müəyyən məntəqədə bir qatardan düşüb, o birisinə minməklə təyin olunmuş yerə gedən. *Tranzit sərnişin.* // Belə sərnişinlər üçün olan. *Tranzit bilet. Tranzit kassa. Tranzit zal.*

**TRAP** [*holl.*] 1. Gəmidə pilləkən. Maşın şöbəsinin trapı. // Gəminin bortuna girmək və ondan düşmək üçün qurğu. *İp trapı.* // Təyyarənin yanına gətirilib qoyulan pilləkən. *Trapla təyyarədən düşmək.*

2. *xüs.* Bəzi işlərdə (tikintidə, dalğıclıqda və s.-də) istifadə olunan müxtəlif növlü və quruluşlu pilləkən, nərdivan. *Tikinti trapı. Dəmir trap.*

**TRAPÉSİYA** [*yun.* trapezion] 1. *hənd.* İki paralel tərəfi olan dördbucaq.

2. İki tros və ya ipdən asılmış tirdən ibarət gimnastika aləti. *Trapesiyada çıxış etmək.*

**TRÁVMA** [*yun.* trauma] Hər hansı xarici təsir (yaralanma, əzilmə, yanma və s.) nəticəsində bədən toxumalarının və ya üzvlərinin zədələnməsi; zədə. *Kəllə travması. İstehsalat travması.* // Əsəb sarsıntısı (adətən “əsəb”, “psixi” sözləri ilə birlikdə). *Mənəvi travma.*

**TRAVMALI** *sif.* Travması olan, zədəli. *Travmalı xəstə.*

**TRAVMATÍK** “Travma”dan *sif. Travmatik zədə. Travmatik nevroz.*

**TRAVMATÍZM** [*yun.*] Hər hansı bir şeylə əlaqədar olan travmatik zədələnmə. *Məişət travmatizmi. İdman travmatizmi.*

**TRAVMATOLÓGİYA** [*yun.* trauma və logos] Tibbin, travmatik zədələr və onları müalicə üsullarından bəhs edən şöbəsi.

**TRAVMATOLOJÍ** “Travmatologiya”dan *sif.*

**TRAYEKTÓRİYA** [*lat.* trajectus – hərəkət] Hərəkət edən hər hansı bir nöqtə və ya cismin fəzada cızdığı xətt. *Yerin süni peykinin trayektoriyası. Meteoritin trayektoriyası.* // *hərb.* Mərminin, güllənin, minanın və s.-nin uçuş xətti.

**TRED-YUNİÓN** [*ing.* trade-union] İngiltərədə: həmkarlar ittifaqlarının adı.

**TRED-YUNİONÍST** [*ing.* trade-unionist] Tred-yunionizm tərəfdarı.

**TRED-YUNİONÍZM** [*ing.* trade-unionism] Fəhlə hərəkatının vəzifələrini kapitalizmin əsaslarına toxunmadan fəhlələrin inqilabi tələblərini həyata keçirmək məsələsi ilə məhdudlaşdıran opportunist cərəyan.

**TREK** *is.* [*ing.*] *idm.* Tamaşaçı tribunaları ilə əhatələnən və bərk örtüyü (beton, asfalt və s.) olan idman qurğusu.

**TREST** [*ing.*] 1. Bir sahənin bir neçə müəssisəsinin birləşməsi, habelə belə birləşmənin mərkəzləşdirilmiş idarəsi, aparatı.

2. *iqt.* İstehsal əməliyyatlarını və satışı mərkəzləşdirmə yolu ilə həddən artıq gəlir almaq məqsədi güdən kapitalist inhisar formalarından biri (bu inhisar formasında birləşdirilmiş müəssisələr ticarət və istehsalat sahəsindəki müstəqilliklərini itirmş olur).

**TRİBÚN** [*lat.*] 1. *tar.* Qədim Romada müxtəlif vəzifəli şəxslərin adı. *Xalq tribunu. Hərbi tribun.*

2. Görkəmli natiq və publisist olan ictimai xadim; natiq. *İnqilab tribunu.*

**TRİBÚNA** [*fr.* tribune, əsli *lat.* tribunal] 1. Stadionlarda, meydançalarda camaat, tamaşaçılar və ya parad qəbul edənlər, nümayişi təbrik edənlər və b. üçün düzəldilmiş hündür sıralı yerlər. *Mərkəzi tribuna. – Firidun və Kürd Əhməd özlərini ikinci mərtəbədə bir evin balkonunda düzəlmiş tribunaya çatdırmağa cəhd edirlər.* M.İbrahimov.

2. Xitabət kürsüsü. *Əynində hərbi köynəyi olan ortayaşlı bir adam tribunaya qalxdı.* Ə.Sadıq. // *məc.* Siyasətçilərin, publisistlərin və b.-nın ictimai fəaliyyətlərinin həyata keçirildiyi yer, mühit. *Ədəbi tribuna.*

**TRİBUNÁL** [*lat.*] 1. Hərbi və çox ağır mülki cinayət işlərinə baxan fövqəladə məhkəmə orqanı. *Hərbi tribunal.* // *top.* Hakimlər; bu orqanın məhkəmə heyəti. *Tribunalın hökmü.*

2. Belə orqanların cinayət işlərinə baxması. *İşi tribunala vermək.* // Bu orqanın məhkəmə iclası.

**TRİKÓ** [*fr.*] 1. Üst paltar üçün naxışlı yun parça. *Kostyumluq triko. – Məktəbə açıqsumağı trikodan qəşəng kostyum geymiş bir cavan gəlirdi.* Ə.Əbülhəsən. // Həmin parçadan tikilmiş. *Səlim təzə tikdirdiyi dama-dama triko kostyumunun pencəyini düzəltdi..* M.Süleymanov.

2. Teatr və ya idman kostyumu kimi geyilən, bədənə sıx yapışan trikotaj paltar. *Rəqqasə trikosu.*

3. Belə qədər bədənin aşağı hissəsini örtən qadın trikotaj alt paltarı. *İsti triko.*

**TRİKOTÁJ** [*fr.*] 1. Maşında toxunmuş parça; toxuma. *İpək trikotaj.* // Belə parçadan hazırlanmış. *Trikotaj kofta.*

2. *top.* Belə parçadan hazırlanmış məmulat. *İdman trikotajı.*

**TRİKOTAJÇI** *is.* Trikotaj sənayesi işçisi.

**TRİQONOMETRÍK** *sif.* [*yun.* trigonon və metreo] 1. Triqonometriyaya aid olan, triqonometriya ilə əlaqədar olan. *Triqonometrik cədvəl.*

2. *geod.* Geodezik ölçmə ilə əlaqədar olan, trianqulyasiya üsulu ilə görülən. *Triqonometrik işarə. Triqonometrik məntəqə.*

**TRİQONOMÉTRİYA** [*yun.* trigonon – üçbucaq və metreo – ölçürəm] Həndəsənin, üçbucağın tərəfləri və bucaqları arasındakı münasibətləri öyrənən bəhsi. *Düzxətli triqonometriya. Sferik triqonometriya.*

**TRİLÓGİYA** [*yun.*] Bir müəllifin ideya ümumiliyi və mövzu ardıcıllığı ilə birləşən üç ədəbi və ya musiqi əsəri. *Əzizə Cəfərzadənin "Eldən-elə", "Aləmdə səsim var mənim" və "Vətənə qayıt" trilogiyası.*

**TRİLYÓN** [*fr.*] Min milyarda bərabər say.

**TRÍO** [*ital.*] 1. Hər birinin müstəqil partiyaları olan üç alət və ya üç səs üçün yazılmış musiqi əsəri. *Çaykovskinin triosu. Pianino, klarnet və faqot üçün trio.*

2. Üç ifaçıdan (müğənni, ya çalğıçıdan) ibarət ansambl; üçlük. *Qarmonçular triosu.*

**TRİUMF** *is.* [*lat.*] 1. Qədim Romada qalib sərkərdənin qoşunu ilə birgə paytaxta təntənəli surətdə daxil olması.

2. Parlaq qələbə.

**TROFİK** *sif. fiziol.* İnsanın qidalanmasını və fəaliyyətini tənzim edən.

**TROLLÉYBUS** [*ing.*] Elektrik qüvvəsi ilə hərəkət edən çoxyerli sərnişin maşını; relssiz şəhər elektrik nəqliyyatı növü.

**TROMB** [*yun.* trombos – laxta] Qan damarlarında əmələ gələn qan laxtası.

**TROMBOFLEBÍT** [*yun.*] *tib.* Vena divarlarında tromb əmələ gəlməsindən ibarət xəstəlik.

**TROMBÓN** [*ital.*] Aşağı və güclü tembrli nəfəslə çalınan boru şəklində musiqi aləti.

**TROMBONÇU** *is.* Trombonda çalan musiqiçi.

**TROMBÓZ** [*yun.*] *tib.* Damarlarda tromb (laxta) əmələgəlmə prosesi.

**TRÓPİK** [*yun.* tropikos] 1. Yer kürəsinin səthində ekvatora paralel və ondan 23°27′ şimala və ya cənuba tərəf uzaqda olan iki xəyali dairədən hər biri. *Oğlaq tropiki.* (*ekvatordan cənuba tərəf*). *Xərçəng tropiki* (*ekvatordan şimala tərəf*).

2. Adətən cəm şəklində **tropiklər** – Yer kürəsinin, həmin dairələr arasında ekvatorun hər iki tərəfində yerləşən isti qurşağı. *Ən isti ölkələrdə – tropiklərdə çay kolu bütün il boyu inkişaf edir və çiçək açır.* "Çay bitkisi".

**TROPÍK** *sif.* [*yun.* tropikos] Tropiklərdə yerləşən, olan. *Tropik qurşaq. Tropik təbiət. Tropik meşə. Tropik bitkilər.* // Tropiklərdə yayılmış, tropiklərə xas olan. *Tropik isti. Tropik xəstəliklər.*

◊ **Tropik il** *astr.* – Günəşin, yaz gecəgündüz bərabərliyi nöqtəsindən iki dəfə keçməsi arasındakı dövr.

**TROYKA** *is.* [*rus.*] Üçatlı minik arabası və ya kirşə.

**TRUBÁ** [*rus.*] Ucunda ağızlıq olan nəfəsli mis musiqi aləti.

**TRÚPPA** [*fr.* troupe] Teatr, sirk artistləri dəstəsi.

**TRUSÍK, TRUSÍ** [*rus.*] Gödək idman şalvarı (tumanı); bu cür kişi və ya qadın alt yay tumanı.

**TUALÉT** [*fr.*] 1. Güzgülü və qutulu kiçik stol. [Oğlan] *tualet önündə bir qadın qədər özünə yaraşıq verdi*. A.Şaiq.

2. İctimai yerlərdə (teatr, kino, restoran və s.-də) ayaqyolu.

3. Zahiri görkəm, yaraşıq, bəzək-düzək. *Məclis üçün hazırlıq görülürdü, xanımlar geyim və tualetlərinə son dərəcə əhəmiyyət verirdilər.* Çəmənzəminli.

◊ **Cərrahın tualeti** *tib.* – operasiyadan qabaq mikrobsuzlaşdırılmış paltar geymə və əlləri yuma.

**TUF** [*lat.* tofus-dan] Vulkanik və ya çökmə mənşəli məsaməli dağ süxuru (tikinti materialı kimi işlədilir). [Zəylik yatağını] *təşkil edən süxurlar əsas etibarilə yura dövrünün porfiritləri, tufları və əhəngdaşılarıdır.* M.Qaşqay.

**TUFAN** *is.* Çox şiddətli, küləkli qar və ya yağış; qasırğa, çovğun, boran, fırtına. *Yox, bizim bağlarımız bunlara öyrəncəlidir; Dözəcək yellərə, tufanlara öyrəncəlidir.* S.Rüstəm. *Tufan həftələrlə davam etdi*. S.Rəhimov. □ **Tufan qopmaq** – tufan olmaq, tufan başlamaq. *Tufan qopar, el ağlar; Çaylar daşar, sel ağlar; Qəriblikdə ölənin; Yasın tutar el, ağlar*. (Bayatı). *Əssə külək, qopsa da tufan yenə; Əyməyə əsla gücü çatmaz mənə.* M.Ə.Sabir. // Tufanlı hava. *Bu tufanda hara gedirsən? – Usta gəmiçilər tufanda belə; Sükanı düz tutar öz əllərilə.* S.Vurğun. // *məc.* Keşməkeş; ağır həyat təcrübəsi, ağır sınaq. [Əlikram Hidayətə:] *Eşit bu tufanlardan dipdiri çıxmış kişini.* B.Bayramov.

◊ **Tufan qoparmaq (salmaq)** – b a x **qiyamət qoparmaq** (“**qiyamət**”də). *Koroğlu qayıtmaz, tufan salmasa; Cida işlətməsə, qılınc çalmasa*. “Koroğlu”.

**TUFANLI** *sif.* Qasırğalı, boranlı, tufan olan. *On üçüncü ilin qış fəslində tufanlı bir gecənin səhərində Həsənağanın meyiti məscid divarının dibində bulundu*. S.Hüseyn. // *məc*. Keşməkeşli, qovğalı, dəhşətli. *Sabahkı tufanlı hərb meydanında; Ağ olsun üzümüz ata yanında*. S.Vurğun.

**TUFLÍ** [*rus.*] Ayağın topuqdan aşağı hissəsini örtən ayaqqabı. *Dabanlı tufli. Lak tufli.* – [Qəhrəmanın] *əynində bahalı kostyum, boğazında ipək qalstuk, ayağında sarı tufli, başında koverkot kepka vardı*. Ə.Vəliyev.

**TUĞ** *is.* 1. Qədimdə: padşahların, vəzirlərin və ya yüksək rütbəli şəxslərin baş geyimlərinə taxdıqları tük və ya saçaq şəklində bəzək.

2. Qədimdə: at quyruğu qıllarından düzəldilmiş qoşun bayrağı; ümumiyyətlə, bayraq.

3. Keçmişdə: məhərrəmlik mərasimində güzgülər və s. ilə bəzədilmiş cürbəcür şəbih və dəstə əlaməti.

◊ **Tuği-lənət olub boğazına keçmək** – əl çəkməmək, təngə gətirmək, yapışıb əl çəkməmək.

**TUĞRA** *is.* [*ər.*] 1. Gerb, dövlət nişanı.

2. Şah fərmanı.

**TUL** [*ər.*] *köhn. dan.* Uzun. [Ata:] *Bu tul ömrümdə çox vilayətlər gəzib, cürbəcür adamlara rast gəlmişəm..* Ə.Haqverdiyev. □ **Tul çəkmək (tapmaq)** – uzanmaq, uzun olmaq, uzun çəkmək. *Tul tapar kəlamımız, qareə həm məlal olar*. M.Ə.Sabir. *Görmüşəm çox gözəl-gözəl şeylər; Söyləsəm gər, bəyani tul çəkər.* A.Səhhət. **Tul etmək** – uzatmaq. *Bəsdir daha tənqid elədin xas ilə amı; Çox yazma, danışma, daha tul etmə kəlamı.* C.Cabbarlı.

**TULA** *is.* 1. Hamar uzun tüklü, uzun qıçlı, iri ov iti cinsi. *..Turac-qırqovul ovunda müvəffəqiyyət tulanın məharət və təcrübəsindən asılıdır.* M.Rzaquluzadə.

2. Söyüş mənasında. [Zeynal:] *..Sözlərinə bir baxın, nanəciblər, qudurğanlar, tulalar!..* C.Cabbarlı.

**TULANBAR** *is. köhn.* Hamamda suyu qızdırmaq üçün ocaq; külxan. *Yer üzündə ikicə şəhərdə hamamların tulanbarında peyin yandırırlar: bir Naxçıvanda, bir də Təbrizdə.* C.Məmmədquluzadə. // Qazanxana.

**TULANBARÇI** *is. köhn.* Tulanbara xidmət edən adam; ocaqçı, külxançı. *Konsul dərhal tulanbarçının gətirilməsinə əmr verdi.* M.S.Ordubadi.

**TULANİ** *sif.* [*ər.*] Uzun-uzun, çox uzun, uzun-uzadı, uzun. *Tulani şikayətlər edərdin bizə, Seyyid; Bəs ağ şəhi görcək nə üçün müxtəsər etdin?* S.Ə.Şirvani.

**TULAPAYI** *is. dan.* Birisini öz tərəfinə çəkmək, ələ almaq üçün ona verilən və ya təklif edilən cüzi pul və s., birinə saymazcasına verilən pul; dilənçipayı. [Xanlar:] *Cənab*

*Abuzər bəy, ..sənin tulapayına mənim ehtiyacım yoxdur.* M.Hüseyn.

**TULLAMA** "Tullamaq"dan *f.is.*

**TULLAMAQ** *f.* 1. Bir şeyi az və ya çox şiddətli bir hərəkətlə yaxına və ya uzağa, yuxarıya və ya aşağıya atmaq; fırlatmaq. *Adətimiz daş idi dəva günü; Tullar idik əldə sapan qıjhaqıj.* M.Ə.Sabir. *Rəfizadə şərab şüşəsini götürüb, Mahmud xana tulladı.* M.S.Ordubadi. [Qəhrəman] *.. sapanda daş qoyub hərləyən kimi hərlədi və var gücü ilə ilanı qayadan aşağı tulladı.* Ə.Vəliyev. // Bir şeyi əldən buraxaraq yerə düşürmək, yerə atmaq. *Papiros qırıntılarını yerə tullamaq olmaz!*

2. Çəkmək, itələmək, kənara çəkmək, atmaq. *..Zərrintac xanım bəzəkli yorğanı üstündən kənara tulladı.* S.Rəhimov.

3. Tökmək, salmaq. *Biz laqeyd olsaq əgər; Onlar məşum bombanı; Tullaya bilər yekə; İnsanlığın ömrünə.* R.Rza. *Təyyarələr beş yüz kiloqram ağırlığında olan bombaları yerə tulladı.* Ə.Vəliyev.

4. Tərk etmək; buraxıb getmək. *Hələlik tullamışıq xaneyi-viranələri; Dolanıb kişvəri-Tiflisdə kaşanələri.* M.Ə.Sabir.

5. *məc.* Əl çəkmək, atmaq. *Qırxların əlindən bir badə içdim; Tulladım namusu, həyadan keçdim.* Molla Cümə.

6. *məc. dan.* İçmək. *Cümşüd bəy evdən çıxmamış bir neçə piyalə qırmızı çaxır tullayıb getdi.* E.Sultanov.

**TULLANIŞ** *is.* 1. Tullanma işi, tullanma tərzi; tullanma. *İdman tirində tullanış.*

2. *xüs.* Qazın və ya mayenin quyudan fasilələrlə vaxtaşırı çıxması, dışarı vurması. ..[Hüseynağa] *hələ də qaz tullanışı əlamətləri gözləyir.* M.İbrahimov.

**TULLANMA** "Tullanmaq"dan *f.is.*

**TULLANMAQ** *f.* 1. Sıçramaq, hoppanmaq, atılmaq, atılıb-düşmək. *Harın at qalxdı dik ayaq üstə; Ox dəyən ahu kimi tullandı.* A.Səhhət. *Qatar gedə-gedə Rüstəm tullanıb, birbaş kəndlərinə doğru yollandı.* T.Ş.Simurq. // Paraşütlə atılmaq, enmək, düşmək. *Təyyarənin ağır zədələndiyini görən təyyarəçi paraşütlə dənizə tullandı.* Ə.Vəliyev.

2. Bir şeyin üstündən atlanıb keçmək, aşmaq, aşıb keçmək, üstündən hoppanmaq. *Tullan bağda hasarı; Ya ağ geyin, ya sarı.* (Bayatı). *Ağaclara dırmanır; Kiçik arxdan tullanır.* M.Dilbazi.

3. İdmanın hündürlüyə və uzununa tullanmaqdan ibarət yüngül atletika növü. [Katib:] *Qəmər çox zirək qızdır. Bildir rayonda yüyürməkdə birincilik, tullanmaqda ikincilik qazandı.* Ə.Vəliyev. *Çeviklik üçün edilən hərəkətlər .. idman alətlərində edilən gimnastika hərəkətlərindən, şey atmaqdan, tullanmaqdan ibarət olan hərəkətlər olub, insan orqanizminə, xüsusən mərkəzi sinir sisteminə çox güclü təsir göstərir.* Ə.Babayev.

4. Atlanıb-düşmək, hoppanıb-düşmək, oynaşmaq. *Hamı oturub baş, bədən, qolqıçlarını tərpədərək yerlərində tullanardılar.* H.Sarabski. *İt istəyir ki, sür-sümükdən yeyib doysun; Quyruğunu belinə qoysun; Oynaqlasın, tullansın.* N.Rəfibəyli.

**TULLANTI** *is.* Bir şeyin, işləndikdən sonra artıq qalan və həmin iş üçün yaramayan hissələri, qalıqları. *Sənaye tullantıları.*

**TULUQ** *is.* 1. İçində maye, yağ və s. saxlamaq, nehrə çalxalamaq üçün qab kimi işlədilən, aşılama ilə hazırlanmış bütöv qoyun və ya keçi dərisi. *Çoban qarşılayır bizi xoşsifət; Tuluqdan süd tökür: Buyurun, – deyir.* S.Vurğun. [Göyçək] *südü bişirdi, iki gündən qalmış qatığı tuluğa yığıb çalxadı.* Ə.Vəliyev.

2. B a x **dol**. *Mahmudun çox yaxşı yadındadır ki, o, dolamaçarxı hərlədib tuluqla quyudan su çəkərdi.* Y.Əzimzadə.

3. *köhn.* Bir tuluq tutan qədər maye ölçüsü. [Zümrüd Məlikməmmədə:] *Onda gərək qırx şaqqa ət, qırx tuluq da su alıb gətirəsən.* Çəmənzəminli. [Həsənov:] *Deyirlər ki, .. fermaya get, bir tuluq yağdan, pendirdən götürmə..* M.İbrahimov.

◊ **Zəhər tuluğu** – çox acıdil adam haqqında işlədilir. **Şişib tuluğa dönmək** – 1) çox şişmək; 2) həddən artıq kökəlmək.

**TULUQBALABANI, TULUQZURNASI** *is.* İçərisinə hava üfürülərək basdıqca uzun və yeknəsəq səs çıxaran bir-birinə bənd edilmiş tuluq və zurnadan ibarət primitiv musiqi aləti.

**TULUQLANMA** "Tuluqlanmaq"dan *f.is.*

**TULUQLANMAQ** *f.* 1. Şişmək. *Rəisin tuluqlanmış* (f.sif.) *qəzəbli gözlərindən qığılcım töküldü.* M.Hüseyn.

2. Nəmdən şişmək (toxum haqqında). *Əgər indi toxumlar yer üzərində qalsa, onlar tuluqlanıb donacaq, heç bir səmərəsi olmayacaq və fayda verməyəcəkdir*. S.Rəhimov.

**TULUMBA** [*ital.*] *köhn.* Kaçalka, nasos. *Quyulardan neft dartan dərin tulumbaların yeknəsəq səsləri eşidilirdi.* S.Hüseyn. *Tulumbaların taq-taqla qalxıb-düşməsi və qara neftin dağ çayları kimi şır-şırla axıb çənlərə tökülməsi .. əzəmət təşkil edirdi.* B.Talıblı.

**TUM** *is. dan.* 1. Toxum. *Kələm tumu. Soğan tumu əkmək. – Sonra bir ağacın tumunu, o biri ağacın şitilini salmaq, üçüncüsünü peyvənd etmək zəruridir.* S.Rəhimov. // Günəbaxan toxumu. *Tum çırtlamaq. – Onbaşı iki stəkan tum alıb qızlara payladı.* M.S.Ordubadi.

2. *məc.* Nəsil, soy, döl.

◊ **Tumunuz kəsilsin** – b a x **toxumunuz kəsilsin** ("**toxum**"da).

**TUMAC** *is.* Aşılanmış nazik və yumşaq keçi və ya qoyun dərisi. [Rəisin] *ayaqlarında bahalı tumacdan uzunboğaz çəkmə var idi.* İ.Əfəndiyev. // Həmin dəridən tikilmiş. *Tumac məs*. – [Hacı] *sonra əlini cibinə atıb, ..yekə tumac kisəsini çıxartdı, onu açıb, əzilmiş və sürtülmüş kağızları dartıb çıxartdı.* S.Rəhimov.

**TUMAN** *is.* Beldən aşağı qadın geyimi və ya qadın paltarının həmin hissəsi. *Sənəm .. koftasının ətəyini tumanının altına salmışdı.* Ə.Əbülhəsən. *Axşamüstü Xoşqədəm nənə yaşıl məxmər donunu, qara atlaz tumanını sandıqdan çıxarıb geyindi*. S.Qədirzadə. // Beli bağlı və ya rezinli, düyməsiz kişi şalvarı. *Satin tuman.*

**TUMANBAĞI** *is.* Tumanı saxlamaq üçün belinə keçirilən bağ. [Ağa Kərim xan:] *Bu şalvara nə üçün düymə tikilib, məgər tumanbağı yaramaz?* N.Vəzirov.

**TUMANÇAQ** *sif.* və *zərf* Əynində tumanı olmayan, əyninə heç bir şey geyməmiş, tumansız. [Musanın nəvəsi] *dörd yaşına qədər tumançaq* (z.) *gəzərdi*. Qantəmir. *Geyinməmiş, tumançaq, ayaqyalın balalar maşınları dövrəyə aldılar.* B.Bayramov.

**TUMAN-KÖYNƏK** *is.* Tuman və köynəkdən ibarət alt geyimi (komplekti). *Sila soldatların tuman-köynəklərini yuyub, kolun üstünə sərdiklərini gördü.* S.Vəliyev.

**TUMANLI** *sif.* Tuman geymiş, əynində tumanı olan. [Almaz:] *Oyanda da qırmızı tumanlı bir qız yekə bir çomaqla və muncuqlu keçilərini suya aparır.* C.Cabbarlı.

**TUMANLIQ** *is.* Tuman tikmək üçün yarayan (parça). [Mahmud Sonaya:] *Hələ gör sənə nə gətirmişəm; çit, şal, yorğanüzü, tumanlıq*. Z.Xəlil. // Sif. mənasında. *Tumanlıq çit.*

**TUMAR**[1] *is.* Səliqə vermək üçün saçı, tükü əllə sığallama, sığal-səliqə vermə; sığal. □ **Tumar vermək (çəkmək)** – b a x **tumarlamaq**. *Başına tumar çəkmək. – Niyaz atı çulladıqdan sonra onun başını sığalladı, yalına tumar verdi, gözlərini yumdu.* Ə.Vəliyev. *Yenə sükut aldı lal otağını; Baxdı... saqqalına tumar da verdi.* N.Xəzri. **Özünə tumar vermək** – üst-başına, saçlarına sığal-səliqə vermək. *Student Həmzə bəy güzgünün qarşısında durub özünə tumar verirdi.* Çəmənzəminli.

**TUMAR**[2] *is. köhn.* Lülələnmiş ağ və ya yazılı kağız. [İbn Davud] *..qurşağından tumarı çıxartdı, kağız kəsib götürdü.* M.S.Ordubadi. // Namə, kitab, dəftər. *Od tutar kağızlar, alışar qələm; Səbt etsələr hər tumara dərdimi.* Q.Zakir.

**TUMARLAMA** "Tumarlamaq"dan *f.is.*

**TUMARLAMAQ** *f.* Səliqəyə salmaq üçün sığallamaq, sığal-səliqə vermək. *Hacı .. börkünü tumarladı*. M.S.Ordubadi. // Nəvaziş əlaməti olaraq əlini birinin başına və s. çəkmək; oxşamaq. *Pişiyi tumarlamaq. – Uşaqlar əllərilə ördəkləri tumarlayıb suallar yağdırırdılar*. H.Seyidbəyli.

**TUMARLANMA** "Tumarlanmaq"dan *f.is.*

**TUMARLANMAQ** *qayıd.* Özünü, saçını, başını səliqəyə salmaq, özünə sığal, sığal-səliqə vermək. *Salavatlar məxrəcdən gəlmədə davam edir, saqqallar tumarlanırdı.* Çəmənzəminli.

**TUMBUL** *sif.* Gombul, koppuş. *Tuturam oğlumun tumbul əlindən; O gedir yanımca gülümsəyərək*. N.Xəzri. *Orada, pəncərənin qabağında tumbul bir körpə oynayır*. B.Bayramov.

**TUMCAR** *is.* Çəltik şitili.

**TUMCARLIQ** *is.* Çəltik şitilliyi.

**TUMLAMA** "Tumlamaq"dan *f.is.*

**TUMLAMAQ** *f. dan.* 1. Tum hasil etmək, tum əmələ gətirmək; toxumlamaq. *Alaq otları qaldıqca tumlayır.*

2. Toxum səpmək. *Cütçü batıb qan-tərə, yer şumlayır; Şumladığı tarlaları tumlayır.* M.Ə.Sabir.

**TUMLU** *sif.* Tumu olan, çəyirdəkli. *Tumlu meyvələr.*

**TUMLUQ** *is.* və *sif. dan.* Əkmək üçün ayrılmış və ya yarayan; toxumluq. [Aslan bəy Tarverdiyə:] *Keçən qışda gəldin, .. 3 pud tumluq buğda çəkdim, apardın.* C.Cabbarlı.

**TUMOV** b a x **zökəm**. [Gənc:] *Ağalar, son xəbər! General həzrətləri tumov olmuşdur.* Ə.Məmmədxanlı.

**TUMOVLU** *sif.* Tumov (zökəm) olmuş. *Tumovlu adam.*

**TUMSƏPƏN** b a x **toxumsəpən**.

**TUMSUZ** *sif.* Tumu, çəyirdəyi olmayan; çəyirdəksiz. *Tumsuz üzüm.*

**TUMTURŞ** *sif.* Lap turş, çox turş. *Tumturş alça.*

**TUMURCUQ** *is.* Gül, yarpaq və ya zoğun rüşeymi; düymə, puçur. *Qızılgülün tumurcuğu. – Ağacların tumurcuqları açılıb, yarpaq olmuşdu.* B.Bayramov.

**TUMURCUQLANMA** "Tumurcuqlanmaq"-dan *f.is.*

**TUMURCUQLANMAQ** *f.* 1. Tumurcuq əmələ gəlmək, düymə açmaq; puçurlanmaq. *Aprel-mart aylarında ağaclar tumurcuqlanır. – İlk gül, çiçək torpaqdan baş qaldırmaq üçün yerdə tumurcuqlanmışdı.* S.Rəhimov.

2. *məc.* Əmələ gəlmək, doğmaq, yetişmək, çiçək açmaq. *Sıxdımı dost kimi əlimi bahar; Qəlbimdə arzular tumurcuqlanar.* S.Rüstəm.

**TUMURCUQLU** *sif.* Tumurcuğu olan, tumurcuq əmələ gətirmiş, tumurcuq açmış. *Tumurcuqlu zoğ.*

**TUNC** *is.* 1. Qalay, qurğuşun və s. metallarla qarışıq mis ərintisi. *Oymaqlar əksəriyyətlə çuqundan, poladdan və tuncdan hazırlanır.* □ **Tunc rəngi** – qızılı-qəhvəyi rəng. *İkindi günəşinin altında sular tunc rənginə çalırdı.* Mir Cəlal. *Dağ günəşi tunc rəngə; Boyamışdı gözəli.* N.Rəfibəyli. // Tuncdan qayrılmış, tuncdan tökülmüş. *Tunc dəstək. – Yaşıl məhəccərli dördkünc bağçada ..Nizaminin tunc heykəli qoyulmuşdu.* M.Hüseyn.

2 *məc.* Sarsılmaz, möhkəm, bərk, qüvvətli mənasında. *Qüdrətimiz bəllidir hər yerdə, hər bucaqda; Sarsılmaz qurduğumuz dostluğun tunc qalası.* S.Rüstəm. *Sən yüksəldikcə bir səs deyir: – Min illər yaşa; Üfüqlərə toxunsun tunc biləkli qolların!* M.Müşfiq.

◊ **Tunc dövrü** *arxeol.* – tunc (metal) işləndiyi ən qədim dövr (bu dövrdə hələ dəmir məlum deyildi və müxtəlif şeylər qayırmaq üçün əsas metal tunc idi).

**TUNCLAMA** "Tunclamaq"dan *f.is.*

**TUNCLAMAQ** *f.* Üzünə nazik tunc təbəqəsi çəkmək və ya tunc rənginə boyamaq.

**TÚNDRA** [*fin.*] Yer kürəsinin arktik qurşağının sərt iqlimi, daimi donuşluq və az bitkisi olan meşəsiz sahəsi.

**TUNÉL** [*ing.*] Yer altında və ya dağların içindən koridor şəklində qazılmış keçid, yol. *Dəmiryol qatarı uzun tuneldən çıxıb, yaşıl meşənin qoynuna girdi.* M.S.Ordubadi. *Şəfəqi sayrışan bir səhər olur; Günəşli metrolar, aylı tunellər.* S.Vurğun.

**TUNELÇİ** *is.* Tunel qazıyan fəhlə.

**TUNQ** [*çin.*] *bot.* Qiymətli texniki yağ alınan tropik ağac. *Tunq yarpağı.* – [Səfərli Aydına:] *Saysız-hesabsız tunq ağacları çiçəkləyəcək.* H.Seyidbəyli. // Həmin ağacın toxumundan alınan. *Tunq yağı.*

**TUR** *is.* [*fr.*] Yarış zamanı idman tədbirinin müəyyən bir hissəsinin başa çatdığı dövr, mərhələ.

**TURAC** *is. zool.* Toyuq cinsindən ov quşu. *Bir məsəl qalmışdır ata-babadan; Ucarda turacdır, qaçarda ceyran.* S.Vurğun.

**TURBÁZA** [*rus.* "туристическая база"nın ixtisarı] Turist bazası; turistlərin istirahəti və qalıb gecələməsi üçün lazımi şeylərlə təchiz edilmiş yer.

**TURBÍN** [*lat.*] Buxar, qaz, su enerjisini pərli rotor vasitəsilə mexaniki enerjiyə çevirən mühərrik.

**TURBİNÇİ** *is.* Turbin mütəxəssisi və ya turbinə xidmət edən fəhlə. *Turbinçi çilingər.*

**TURBOBÚR** [*rus.*] Dərin quyuları qazımaq üçün hidravlik qazıma mühərriki.

**TURÍST** [*fr.* touriste] Turizmlə məşğul olan adam. *İlk turist dəstələri.*

**TURÍZM** [*fr.* tourisme] İstirahət və öz vətəninin müxtəlif yerləri ilə və ya başqa

ölkələrlə tanış olmaq məqsədilə edilən səyahət; piyada, velosiped, xizək və s. ilə səyahətdən, yürüşdən ibarət idman növü. *İdman turizmi. Dağ turizmi.*

**TURNÍK** [*fr.* tourner – fırlanma] Üfüqi vəziyyətdə iki dayağa bərkidilmiş girdə metal tipdən ibarət gimnastika aləti. *Ancaq bircə nəfər kim idisə, həyətdə turnikdə idman eləyirdi*. Mir Cəlal.

**TURNİKÉT** [*fr.* tourniquet] İctimai bağlara, stadiona, stansiyaya və s.-yə gələn adamların bir-bir içəri keçməsi üçün çarpaz birləşdirilmiş tirlərdən ibarət fırlanan qurğu.

**TURNÍR** [*alm.*] Orta əsrlərdə: rıtsarların cəngavərlik yarışı. // Bütün iştirakçıların bir-biri ilə ancaq bir dəfə görüşməsindən ibarət idman yarışı. *Futbolçuların Olimpiya turniri. Şahmat turniri.*

**TURP** *is.* Qalın kökü-başı olan birillik bostan bitkisi – tərəvəz növü. *Ağ turp* (*ağrəngli iribaşlı turp*). *Qırmızı turp* (*qırmızırəngli xırdabaşlı turp*). *Ala turp* (*alarəngli xırdabaşlı turp*). – *Ənvər ləzzətli dolmanı iştaha ilə yeyir, kəvərdən, turpdan tez-tez götürüb ağzına qoyurdu.* Ə.Vəliyev.

◊ **Başında turp əkmək** – çox incitmək, bərk cəzalandırmaq, əziyyət vermək. *Xan yanında nökərəm; İşim yoxdur, bekaram; Töycünü gətirməsən; Başında turp əkərəm.* (Bayatı). **Yurdunda (yerində) turp əkmək** – xaraba qoymaq, viran qoymaq, dağıtmaq. [Kor:] *Ağaxan bəy sənin yurdunda .. bir yekə turp əkəcəkdir.* S.Rəhimov.

**TURPƏNG** *is. bot.* 1. Xaççiçəklilər ailəsindən olub, toxumundan texniki yağ alınan mədəni bitki.

2. Sarı çiçəkləri olan alaqotu.

**TURŞ** *sif.* [*fars.*] Sirkə, limon, lavaşana və s. dadında olan. *Turş pomidor. Turş alça.* – *Heç kəs ayranına turş deməz.* (Məsəl). *..Görürsünüz ki, Kür suyunun dadı nə acıdır, nə şordur, nə turşdur, ..nə iylidir*. C.Məmmədquluzadə.

**TURŞALMA** "Turşalmaq"dan *f.is.*

**TURŞALMAQ** *f.* Turş olmaq. *Alçadan ağzım turşaldı.*

**TURŞALTMA** "Turşaltmaq"dan *f.is.*

**TURŞALTMAQ** *f.* 1. Turş etmək.

2. "Üzünü", "üz-gözünü" və s. sözlərlə *məc.* – narazılıq, məmnunsuzluq əlaməti olaraq üz-gözünü yığmaq, büzüşdürmək, qaşqabağını tökmək. [İbrahim bəy:] *Nə olub yenə qaşqabağını turşaldıbsan?* Ə.Haqverdiyev. *Usta yarı yol getməmişdi, bir ayrı kişi ilə baş-başa gəlib toqquşdular və ikisi də üzlərini turşaldıb sudan çıxdılar ki, bir-birini döysünlər*. Çəmənzəminli.

**TURŞAŞİRİN** *sif.* [*fars.*] 1. Dadı həm turş, həm də şirin olan; meyxoş. *Turşaşirin nar.* // *is.* Belə dadan içki, maye. [Bir muzdur:] *Suya .. alça lavaşanası salırlar. O qədər qalır ki, əriyir. Sonra da qənd qatırlar, olur turşaşirin..* Ə.Əbülhəsən.

2. Alaqoradan bişirilən turşməzə doşab növü.

**TURŞƏNG** *is.* [*fars.*] Turş dadan, uzunsov yarpaqları olan yeyilən göyərti. *İki dəstə turşəng. Dovğaya turşəng tökmək.*

◊ **Turşəng turşusu** *kim.* – rəngsiz kristallar şəklində üzvi birləşmə (kimya və toxuculuq sənayesində işlədilir).

**TURŞGİLƏ** *is. bot.* Bütün il boyu tökülməyən gümüşü-yaşıl rəngli yarpaqları olan zərif kol bitkisi.

**TURŞLAŞDIRMA** "Turşlaşdırmaq"dan *f.is.*

**TURŞLAŞDIRMAQ** *f.* Turş hala salmaq, turş etmək.

**TURŞLAŞMA** "Turşlaşmaq"dan *f.is.*

**TURŞLAŞMAQ** *f.* Turş olmaq, turş hala gəlmək, turşumaq.

**TURŞLUQ** *is.* 1. Turş şeyin halı; turş dad, turş dadma.

2. *məc.* Narazılıq, inciklik. ..[Qonaq] *elə ki balaca bir turşluq sezdi, daha onun üçün hər şey qurtardı.* S.Rəhimov.

**TURŞMƏZƏ** *sif.* Azacıq turş dadan; turştəhər. *Turşməzə nar. Turşməzə dovğa*. – [Hümmətəli] *həmişə cibini meyvə qurusu ilə, turşməzə konfetlərlə doldurar, rast gəldiyi dost-aşnasını bu şeylərə qonaq eləməyi sevərdi*. M.Hüseyn.

**TURŞMƏZƏLİK** *is.* Turşməzə şeyin halı; turşməzə dad, turşməzə dadma.

**TURŞSU** *is.* Müalicə sularından birinin adı (Şuşada Turşsu deyilən bulağın adından).

**TURŞU** *is.* 1. İçi doğranmış sarımsaq, bibər, göyərti və s. ilə doldurulub sirkəyə qoyulan

badımcan, bibər, göy pomidor. // *top.* Duza və ya sirkəyə qoyulan xiyar, badımcan, pomidor, bibər və s. [Səlimə:] *Küpənin dibində bir az gərək turşu olsun.* Ə.Haqverdiyev.

2. Turş dad vermək üçün yeməyə salınan, qatılan alça qurusu, lavaşana, albuxara və s. *Ətə turşu qatmaq. Bozbaşa turşu salmaq.*

3. *kim.* Adətən turş dadan hər hansı bir kimyəvi birləşmə. *Sulfat turşusu. Turşu oksidi. Yağ turşusu.*

4. *xüs.* Bir şeyin tərkibində turşunun dərəcəsi. *Mədədə turşunun artması. Torpaqda turşunun miqdarını təyin etmək.*

◊ **Turş sular** – tərkibində karbon turşusu olan müalicə (mədən) suları.

**TURŞUBADIMCAN** *is.* İçi doğranmış sarımsaq, bibər, göyərti və s. ilə doldurulub sirkəyə qoyulan badımcan.

**TURŞUQOVURMA** *is.* Qızardılmış ət, soğan, şabalıd və albuxaradan ibarət plov xuruşu (qarası). *Turşuqovurma bişirmək.*

**TURŞUQOVURMALI** *sif.* Xuruşu (qarası) turşuqovurmadan ibarət olan (plov haqqında). [Səriyyə:] *Mənim plovum Adilin çox xoşuna gəlirdi. Ona görə də düyü arıtlayıb, turşuqovurmalı plov bişirərək dəmə qoydum.* İ.Əfəndiyev.

**TURŞULU** *sif.* Turşusu olan, turşu ilə bişirilən, turşu ilə yeyilən. [Məşədi Səməd:] *Hələ bunun turşulu dolması var.* S.S.Axundov.

**TURŞULUQ** *is.* Turşu (1-ci mənada) hazırlamaq üçün. *Turşuluq badımcan.*

**TURŞUMA** “Turşumaq”dan *f.is.*

**TURŞUMAQ** *f.* 1. İstidən, çox qalmaqdan və s. səbəblər üzündən qıcqırıb xarab olmaq, şişib qoxumaq. *Qatıq turşuyub.* // Qıcqırma halında olmaq; acımaq, qıcqırmaq. *..Şərab ağzıaçıq qalanda turşuyub sirkə olur və sirkə açıq qalanda dönüb su olur.* H.Zərdabi.

2. “Üzü”, “üz-gözü” və s. sözlərlə *məc.* – narazılıq, məmnunsuzluq əlaməti olaraq üz-gözü yığılmaq, büzüşmək, qaş-qabağı tökülmək. *Yarməmmədin üz-gözü yığışdı, turşudu.* M.İbrahimov.

**TURŞUMUŞ** *f.sif.* 1. İstidən, çox qalmaqdan və ya başqa səbəbdən qıcqırmış, qıcqırıb xarab olmuş, şişib qoxumuş. *Turşumuş süd. – İrəlidəki qalın meşədən turşumuş xəzəl qoxusu gəlirdi.* M.Hüseyn.

2. *məc.* Narazı, pərt; narazılıq ifadə edən. *Narazılığı turşumuş üzündən bilinir. – Nurcahan xala həyətə girər, nəzəri kişinin turşumuş sifətinə sataşdıqda qıçları quruyardı.* H.Sarabski.

**TURŞUTMA** “Turşutmaq”dan *f.is.*

**TURŞUTMAQ** *f.* 1. Turşumasına səbəb olmaq; qıcqırtmaq. *Qatığı turşutmaq. Südü turşutmaq.*

2. “Üzünü “, “üz-gözünü” və s. sözlərlə *məc.* – narazılıq, məmnunsuzluq əlaməti olaraq üz-gözünü yığmaq, büzüşdürmək, qaş-qabağını tökmək. *Bu əsnada şeyx cənabları birdən üzünü naxoş kimi turşudub əlini qoyur belinə və “boy-boy” deyib üzüqoylu düşür.* C.Məmmədquluzadə. *Əmrah üzünü narazılıqla turşutdu.* Q.İlkin.

**TURŞUYADAVAMLI** *sif. xüs.* Turşu təsir etməyən. *Turşuyadavamlı materiallar. Turşuyadavamlı qablar.*

**TURŞUYADAVAMLILIQ** *is.* Turşuyadavamlı şeyin halı. *Materialların turşuyadavamlılığı.*

**TURUNC** b a x **narınc**. [Əmrah:] *Alması, heyvası, narı, turuncu; Payız yaxşı olur qora bağları.* “Əmrah”.

**TURUNCU** b a x **narıncı**.

**TUŞ**[1] 1. *is.* Qabaq, qarşı, ön, qənşər. *Arvad çay verdikdən sonra* [ərinin] *tuşunda stulda oturdu.* Ə.Vəliyev. □ **Tuş gəlmək (olmaq)** – 1) rast gəlmək, təsadüf etmək, qabağına çıxmaq, rastlaşmaq. [Nəbi:] *Maltəpədə düşmən bizə tuş oldu.* “Qaçaq Nəbi”. *Ədalət canavara tuş gəlmiş quzu kimi, naçar nəzərlərlə aşağıdan-yuxarı zabitə baxırdı.* Mir Cəlal; 2) *məc.* mübtəla olmaq, düçar olmaq, uğramaq. [Kazım Vaqifə:] *Amma olmasın ki, xanın qəzəbinə tuş gəlim.* Çəmənzəminli. *Daim sevinc axtaran daim qəmə tuş olur.* B.Vahabzadə.

2. *zərf* Birbaşa, düz, bilavasitə. [Katib:] *Bu yarğanın başından tuş İstisuya gözəl bir funikulyor çəkmək olardı.* B.Bayramov.

**TUŞ**[2] [*alm.* Tusch] Bir təntənə münasibətilə (birisinin şərəfinə düzəlmiş məclisdə, birini təbrik zamanı, mükafat veriləndə və s.) çalınan qısa musiqi pyesi. *Salonda tuş çalındı.*

**TUŞ**[3] [*alm.* Tusche] Xüsusi surətdə hazırlanmış qara və ya başqa rəngli sulu boya (çertyoj, rəsm çəkmək və yazmaq üçün).

**TUŞATAN, TUŞVURAN** *is.* və *sif.* Nişanı tuş vuran, nişanı düz vuran, mahir atıcı (nişançı), sərrast atıcı.

**TUŞQUL** *is.* 1. Nişanalma, nişanlama, qarovullama.

2. *sif.* bax **tuşatan, tuşvuran**. [Qoca:] *Belə tuşqul atıcı mən görməmişəm, qarovullamağı da çox uzaq çəkmədi, amma yenə düz vurdu.* A.Divanbəyoğlu.

**TUŞQULLAMA** "Tuşqullamaq"dan *f.is.*

**TUŞQULLAMAQ** bax **tuşlamaq**. *Alı tutduğu işin nəticəsini fikirləşmədən bu dəfə həmən yasavulu tuşqulladı.* M.Hüseyn.

**TUŞQULLANMA** "Tuşqullanmaq"dan *f.is.*

**TUŞQULLANMAQ** bax **tuşlanmaq**. [Oğulun] *enli kürəklərinə tuşqullanan* (f.sif.) *tapançanı kaş anasının ürəyinə sıxaydılar.* Mir Cəlal.

**TUŞLAMA** "Tuşlamaq"dan *f.is.*

**TUŞLAMAQ** *f.* 1. Nişan almaq, nişanlamaq, tuş qarovullamaq, hədəfə yönəltmək. *Yaşar haman saat tüfəngi* [qurda] *tuşlayıb çaxdı*. M.Rzaquluzadə.

2. Yönəltmək, səmtləndirmək. *Kamal gözlənilməz bir sürətlə havada ilmək vurub, ..təyyarəsini faşist təyyarəsinə tuşladı*. M.Rzaquluzadə.

3. Bir şeyi nişanlayıb ona tərəf getmək; yönəlmək. *Yavaşca özümüzü sol tərəfə verdik və dəryanı tuşlayıb gəldik, çıxdıq bulvara.* C.Məmmədquluzadə. *Maya birbaşa qaragözlü qızı tuşlayıb getdi*. M.İbrahimov. ◻ **Əlini (barmağını) tuşlamaq** – əli (barmağı) ilə bir şeyi və ya bir tərəfi göstərmək, əlini (barmağını) uzatmaq.

**TUŞLANMA** "Tuşlanmaq"dan *f.is.*

**TUŞLANMAQ** *məch.* Nişan alınmaq, nişanlanmaq, tuşqullanmaq, yönəldilmək. [Səfər:] *Stolun üstündə parlayır naqan; Düz mənə tuşlanır bu ara lülə*. N.Xəzri.

**TUT** *is.* Ağ, qara növləri olan xırda, şirəli meyvə və onun ağacı (ağ tut şirin, qara tut isə turşməzə olur). *Tut çırpmaq. Tut qurusu. Tut doşabı.* – [Allahverdiyev:] *Tut bəhməzi bişirtdirərik*. Ə.Əbülhəsən.

**TUTACAQ** *is.* 1. Bir şeyin tutulacaq yeri; dəstə, qulp, tutqac. *Pəri nənənin qılçaları titrədi, o, qapını tutacağından çəkdi.* S.Rəhimov. *Sirat əli qapının tutacağında olduğu halda .. baxdı*. Ə.Əbülhəsən.

2. Əl tutmaq üçün körpünün və s.-nin yanlarına vurulan taxta və s. məhəccər. *Balkonun tutacağı. Pilləkənin tutacağı. – Buruğa yalnız bir tərəfdən tutacağı olan ensiz bir körpü uzanmışdı.* Y.Əzimzadə.

3. İsti şeyləri götürmək üçün kiçik döşəkçə; tutqac. *Gözəl tutacaqla çayniki götürüb, stəkanlara süzəndə Həbib otağın qapısını döydü.* Ə.Vəliyev. // İsti tava və s. götürmək üçün alət; tutqac. *Tutacaqla tavanı götürmək.*

4. *məc.* Bəhanə, bəlgə, dəlil. ..[Kişi] *bəhanəni əldə tutacaq edib, övrəti beş-on gün salır kötəyin altına, axırda da övrət cana doyandan sonra çıxıb qaçır.* C.Məmmədquluzadə.

**TUTAQ(Kİ)** bax **tutalım ki**. [Məmmədhəsən əmi Məşədi Oruca:] *İndi mən gedib, tutaq, ziyarət edib gəlmişəm evimə, sən nə deyirsən, gəlməzsən mənim görüşümə?..* C.Məmmədquluzadə. [Carçıyev:] *Mən, tutaq ki, avantüristləri müdafiə edirəm, bəs sən kimi müdafiə edirsən?* İ.Hüseynov.

**TUTAQLAŞMA** "Tutaqlaşmaq"dan *f.is.*

**TUTAQLAŞMAQ** bax **tutaşmaq**. *Xırmançıların gəldiyini görən Alo ürəklənərək özünü qaratikan kollarının başından tulladı. Bir az keçmədən o, cöngə ilə tutaqlaşdı.* S.Rəhimov.

**TUTALIM(Kİ)** *ara s*. Deyək ki, fərz edək ki, belə hesab edək ki. *Tutalım, çox ağıllı tacirsən; İş aparmaqda xeyli mahirsən.* A.Səhhət. [Əbdürrəhman bəy:] *Deyim ki, gəl mənim qızımı al, tutalım ki, dedim, axır alarmı?* N.Vəzirov.

**TUTAM** *is.* Bir dəfədə və birdən tutulacaq miqdar. *Bir tutam ot.* – [Molla Nəsrəddin:] *Padşah mənim bir tutam saqqalımı bir arşın görəndə onun kəndxudası da əlli pud taxılımı beş yüz pud görər də.* "M.N.lətif."

**TUTAR** *is.* Güc, qüvvət, taqət, təpər. [Əzimin] *nə ayaqda durmağa halı, nə danışmağa tutarı vardı*. A.Şaiq. *Verdin öz ömrünü şeirə, sənətə; Qaynar gözlərində qalınca tutar.* O.Sarıvəlli.

**TUTARLI** *sif.* 1. Əsaslı, yerli-yerində, sübutlu, inkaredilməz, hədəfə düşən, düzgün, dəqiq. *Tutarlı sübut. Tutarlı cavab. – Lakin bir adamı yıxmaq üçün tutarlı bir bəhanə də*

*lazımdır.* Mir Cəlal. *Vəkilin tutarlı dəlillərini; Eşidib, az qalır, qalxıb əl vura.* B.Vahabzadə.

2. Bərk, möhkəm. *Tutarlı zərbə. – Uşaq* [Əkbərin] *baldırına tutarlı bir çubuq çəkib gülə-gülə qaçdı*. Mir Cəlal.

**TUTARLILIQ** *is.* Tutarlı şeyin xassəsi, tutarlı olma; sübutluluq, əsaslılıq. *Sübutların tutarlılığı*.

**TUTARSIZ** *sif.* Tutarı olmayan, sübutsuz, dəlilsiz, əsassız. *Tutarsız sözlərə inanan olmaz; Gərək uyğun gələ sözünlə işin.* İ.Soltan.

**TUTARSIZLIQ** *is.* Sübutsuzluq, əsassızlıq, dəlilsizlik.

**TUTAŞ** *sif.* Qalın, sıx, yaxın, bitişik. *Eloğlu kəndindən fərqli olaraq, Dağətəyi də Şahlı kimi qalın və tutaş meşəliyin əhatəsində idi.* S.Rəhimov. *Şəkər islanmış tutaş kirpiklərini qaldırıb Leylanın .. üzünə baxdı*. B.Bayramov.

**TUTAŞMA** "Tutaşmaq"dan *f.is.*

**TUTAŞMAQ** *f.* Vuruşmaq, döyüşmək, yaxalaşmaq, dalaşmaq, qovğa etmək, höcətləşmək. *Vəziyyətdən aydın idi ki, Orucov alman kəşfiyyatçısı ilə tutaşmışdır.* Mir Cəlal. [Səfər:] *Buna şübhən varsa, gəl bir tutaşaq; Ağzın süd qoxuyur, uşaqsan, uşaq.* S.Rüstəm. // Mübarizə aparmaq, döyüşmək, mübarizə etmək. *Doğrudur, Vahid adi bir tələbə idi, Gəldiyev ilə tutaşmağa tabı gəlməzdi, lakin bir adamı yıxmaq üçün tutarlı bir bəhanə də lazımdır.* Mir Cəlal.

**TUTÇULUQ** *is.* Kənd təsərrüfatının, yarpaqları barama qurdu üçün yem olan tut ağacları əkib-becərməklə məşğul olan sahəsi. *Tutçuluğu inkişaf etdirmək*.

**TUTDURMA** "Tutdurmaq"dan *f.is.*

**TUTDURMAQ** *icb.* Yaxalatmaq, həbs etdirmək, həbsə saldırmaq, tutulmasına səbəb olmaq. [Şölə xanım:] *Xan* [Teymur ağanı] *axtardır ki, tutdursun, öldürsün*. M.F.Axundzadə.

**TUTHATUT** *is.* Kütləvi miqyasda aparılan həbs.

**TUTQAC** b a x **tutacaq**. *Körpünün tutqacından tutmaq. Çayniki tutqacla götürmək. – O gənc qadın, əri olan otağın qapısında bir əli tutqacda ..durmuşdu.* İ.Əfəndiyev.

**TUTQUN** *sif.* 1. Batqın, batmış, batıq (səs haqqında). *Mərsiyaxan .. bir neçə nərə çəkib, tutqun səsi ilə çığırdı.* Çəmənzəminli. *Tutqun kal səsilə telefon yenə; – Dur gəl, sözüm vardır! – deyir Hüseynə*. M.Rahim.

2. *məc.* Qəmli, kədərli, məyus, pərişan, qəmgin, qaşqabaqlı. *Tutqun üz. Tutqun görünüş. – Tutqun, məhzun sima ilə sakit, şirin yatmışdır; Döşündəki az yaradan qan fəvvarə atmışdır.* A.Səhhət. *Cəlal dəyişmişdir, Cəlal tutqundur; Xəyalı dağınıq, fikri uçqundur.* S.Vurğun.

3. Açıq olmayan, buludlu. *Tutqun hava. Göyün üzü tutqundur.* // *məc*. Kədərləndirici, cansıxıcı, darıxdırıcı. *..Getdikcə hava sərtləşir, tutqun payız ruzgarı sərt bir qışa çevrilməyə başlayırdı.* S.Rəhimov. *Hava tutqun olan kimi Əziz də bikef idi.* Ə.Vəliyev.

4. *məc.* Üstüörtülü, aydın olmayan, dumanlı, anlaşılmaz. *Tutqun iş.* – [Bəhlul:] *Düşünməli, bir çox tutqun mətləbləri aydınlaşdırmalı oldum.* B.Bayramov.

5. Zəif, ölgün, donuq. *Yağışın arasında küçələrdə yanan elektrik işıqları tutqun bir ziya nəşr edirdi.* S.Hüseyn. *Çırağın tutqun işığında* [Qaragünənin] *iri, ətli üzündəki çopurlar daha dərin görünürdü.* M.Rzaquluzadə.

6. *məc.* Gərgin, qızğın. *İşin ən tutqun vaxtı, yorğun və əzgin bir halda hisli-paslı paltarın içində Nadir yatmaq üçün evə gəldi.* B.Talıblı.

7. Açıq olmayan, tünd (rəng haqqında). [Boz Ukrayna qaramalı] *əsasən boz, gümüşü, yaxud tutqun polad rəngindədir, belində uzunu ağımtıl zolaq vardır.* "Qaramal".

**TUTQUNLAŞMA** "Tutqunlaşmaq"dan *f.is.*

**TUTQUNLAŞMAQ** *f.* 1. Tutulmaq, tutqun olmaq, qaralmaq. *Göyün üzü getdikcə tutqunlaşır, hava tutqunlaşmışdı, narın qar yağırdı.*

2. Rəngi qaralmaq, tündləşmək. *Yağlı boya ilə işlənmiş bədii və köhnə əsərlər tutqunlaşdıqda üzərlərinə lak çəkirlər.* A.Qazıyev.

3. *məc.* Tutulmaq, pozulmaq, pərt olmaq. *Zeynəbin ..ağ üzü tutqunlaşdı*. M.İbrahimov. *Murad qaşlarını çatdı, üzü birdən-birə tutqunlaşdı.* İ.Əfəndiyev.

**TUTQUNLUQ** *is.* 1. Buludluluq, dumanlılıq; tutqun havanın, göyün vəziyyəti. *Göyün üzünü qar havasına məxsus bir tutqunluq bürümüş, şiddətli küləklə qar yağırdı.* S.Hüseyn. *Hər tərəf yaş, duman kimi boz bir tutqunluq içində idi.* Mir Cəlal.

2. Batqınlıq, batıqlıq, boğuqluq (səs haqqında). *Valentinanın səsində tutqunluq, yaxud da qondarma bir gümrahlıq duyulsa idi, bəlkə də sözləri bu üç-dörd nəfərdə əks-təsir oyadar*(*dı*). Ə.Əbülhəsən.

3. *məc.* Qəmlilik, kədərlilik, məyusluq, pərişanlıq, qəmginlik, pərtlik. *Gülyanağın indicə gülümsədiyinə baxmayaraq, sifətindəki tutqunluq, fikir-düşüncənin əksi hələ də qalırdı.* Ə.Vəliyev. *Əlikram daxili narazılığını və tutqunluğunu boğub örtülü saxladı.* B.Bayramov.

4. *məc.* Bir şeydə aydınlığın olmaması; dumanlılıq, qeyri-müəyyənlik. *Çar konsulu beynəlxalq vəziyyətin tutqunluğunu hiss etdirməyə çalışırdı.* M.S.Ordubadi.

5. Tutqun şeyin halı; solğunluq. *İşığın tutqunluğu. Rəngin tutqunluğu.*

**TUTMA** 1. "Tutmaq"dan *f.is.* [Ayrım qızı] *cücələri tutmaması üçün əlinə böyük bir ağac alıb, "kiş, kiş" edərək qızılquşu qovlamağa başladı.* A.Şaiq.

2. *is.* Hər hansı bir xəstəliyin birdən özünü büruzə verməsi, güclənməsi, kəskinləşməsi, növbə (xəstəlikdə). // Yoluxucu, keçici xəstəlik.

◊ **Tutması tutmaq** *məc.* – birdən hirslənmək, coşmaq, tərsliyə başlamaq. [Qasıməli:] *Tutması tutanda da, Allah göstərməsin, öhdəsindən gəlmək olmur.* C.Məmmədquluzadə. [Zalxa:] *Budur ha, yenə tutması tutdu, çıxdı göylərə.* S.Rəhman.

**TUTMAQ** *f.* 1. Əli və ya əlləri ilə bir şeydən yapışmaq. *Məhəccərdən tutmaq. Divardan tutmaq. – Hacı Rəsul, Bəndalının zərbəsindən yıxılmamaq üçün qapıdan bərk tutdu.* Mir Cəlal. *Poçtalyon, Xoşqədəm nənənin qolundan tutub onu maşına tərəf çəkdi.* S.Qədirzadə. // Hər hansı bir vəziyyətdə əlində saxlamaq. *Gah çəkic vurdu əlim, gah da qələm tutdu əlim.* S.Rüstəm. [Oğlan] *indi tüfəngi rahat tuta bilirdi.* M.Rzaquluzadə.

2. Hədəfə dəymək, toxunmaq. *Şillə onu tutdu. – İkram başını cəld yana əydiyinə görə birinci yumruq onun çiynini tutdu.* Ə.Əbülhəsən. *Fatı yerdən daş götürüb itə atdı, lakin daş ala köpəyi tutmadı.* Ə.Abasov.

3. Diri-diri ələ keçirmək, ovlamaq. *Ceyran tutmaq. Balıq tutmaq. – On səkkiz yaşında Bəşir çıxır çinar ağacına dolaşa tutsun, quşu cibinə qoyandan sonra ağacdan yıxılır, qılçası sınır.* C.Məmmədquluzadə. *Mən gedib göyərçini tutdum.* M.Rzaquluzadə. // Həbs etmək, ələ keçirmək, yaxalamaq. *Oğrunu tutdular. – Pristav Əliağa bəy Cavanşirov Nəbini tutub qazamata göndərir.* "Qaçaq Nəbi".

4. Bir şeyin tutumunu, həcmini, yerləşdirmə qabiliyyətini bildirir. *Çamadan paltarları tutdu. Səbət 5 kiloqram meyvə tutur. Stəkan 20 qram tutur. – Meydan izdihamı tutmurdu.* Ə.Abasov.

5. İşğal etmək, zorla bir yeri almaq, ələ keçirmək, bir yerə daxil olmaq. *Gün əyilən zaman* [döyüşçülər] *yeni bir kəndi tutdular.* Ə.Vəliyev.

6. Sirayət etmək, yoluxmaq, xəstələnmək. *Qrip tutmaq. – Məlumdur ki, çiçək naxoşluğunu o uşaqlar tutur ki, onlara çiçək döyülməyibdir.* C.Məmmədquluzadə.

7. Göyərmək, bitmək. *Tinglərin bir hissəsi tutmadı. Şitillərin hamısı tutdu.* – [Kərəm:] *Qərənfillər tutmaz imiş; Gül tikansız bitməz imiş.* "Əsli və Kərəm". // Başqa bitki ilə bitişmək, calanmaq. *Qələm tutdu. Calaqların bir hissəsi tutmadı.*

8. Qapmaq, dişləmək. [Yazgül:] *Deyəsən, yamandəymiş Bobik zəncirini qırıb, gedib istirahət evinin qızlarını tutub.* Ə.Məmmədxanlı. [Fatı:] *Məni o azar dəymiş it tutdu, bala!* Ə.Abasov.

9. Qapamaq, örtmək, əli və ya başqa bir şeylə görünməz etmək. *Ağzını tutmaq. – Əntiqə "Oğru gəlib! Evimizə oğru gəlib!" – deyə ikiəlli gözlərini tutub, hönkür-hönkür ağlayırdı.* Mir Cəlal. *Ümid əlini ağzına tutub, xəlvətcə əsnəyir, gözlərini ovuşdururdu.* B.Bayramov.

10. Yaxşı göstərmək, uyğun gəlmək, yaraşmaq. *Bu paltar onu yaxşı tutur.* – [Yunis xalasına:] *Yaqut sənə demirdi ki, bu şapka məni tutmur?* Ə.Məmmədxanlı.

11. Bir iş görmək istəyənə mane olmaq, əl-qol açmağa qoymamaq. [Mərcan bəy:] *Ay camaat, məni tutmayın, bu kişini öldürəcəyəm.* Ü.Hacıbəyov.

12. Müəyyən şərtlərlə bir işə qəbul etmək, götürmək. [Hacı Mehdi:] *Birini qovub, ayrısını tutursan, o, əzzəlkindən pis çıxır.* Ə.Haqverdiyev. [Ağca] *dünyagörmüş xanımların*

*məsləhətilə bir dayə tutub, uşağı ona tapşırdı.* Mir Cəlal.

13. *məc.* Kirələmək, kirayə etmək, icarə etmək, pul verərək müvəqqəti istifadə etmək. *Taksi tutmaq. Mehmanxanada nömrə tutmaq.* – [Qız dedi:] *Bir münasib mənzil tut, yığışaq ora*. (Nağıl).

14. *məc.* Uyğun gəlmək, bir gəlmək, düz gəlmək. *Atlı ilə piyadanın yoldaşlığı tutmaz*. (Ata. sözü). *Deyirsən, mənimki tutar səninlə; Gəl birgə əbədi bir həyat quraq*. S.Rüstəm.

15. *məc.* Toxunmaq, bərk təsir etmək. *Söz onu bərk tutdu. – Hümmətyarla Mədədin söhbəti Xanpərini bərk tutmuşdu.* Ə.Vəliyev.

16. **Tutmamaq** şəklində – nəticə verməmək, müvəffəqiyyətsizliyə uğramaq, baş tutmamaq. [Vaqif:] *İbrahim xan qardaşı Mehralı bəyin dul arvadına evlənmək istədi, tutmadı*. Çəmənzəminli.

17. ...**tutmuş** şəklində – ...başlamış, ...başlayaraq mənasında işlədilir. *Krasnovodskdan tutmuş ta Daşkəndə kimi hər yerdə bu qəsəbənin cavan tacirlərinə rast gəlmək mümkündür*. Ə.Əbülhəsən.

18. Bir sıra isimlərdən sonra gələrək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: yükünü tutmaq, acığı tutmaq, yer tutmaq və s.

◊ **Tutdu qatıq, tutmadı ayran** – nəticəsindən asılı olmayaraq edilən təşəbbüs haqqında. **Tutduğunu buraxmamaq** – öz dediyindən əl çəkməmək, inad etmək, istədiyini, dediyini etmək.

**TUTMALI** *sif.* Tez-tez tutmalara (2-ci mənada) məruz qalan, tutması olan. *Tutmalı qoca*.

**TUTU** 1. B a x **tutuquşu** 1-ci mənada. *Hər tərəfdə tutu, qumru; Coşur, oxur indən belə*. "Əsli və Kərəm".

2. *məc.* Dili şirin, gözəl sözlər danışan gözəl haqqında. *Tutu danışıqlı, qumru ağızlı: Şirin dili canım aldı, əfəndim!* "Koroğlu". *Şəkər söhbətlidi, şirin dillidi; Tutu kimi xoşzəbanım gedibdi*. Aşıq Ələsgər. // *məc.* Mənasını anlamadan uzun-uzadı danışan adam haqqında.

**TUTUCU** *is.* Bir şeyi tutmaq üçün düzəldilmiş mexanizm, qurğu və s. *Tutucunu işə salmaq*. // Sifət mənasında. *Tutucu alətlər.*

**TUTUQ** b a x **tutqun**. *Verdiyev .. tutuq səslə cavab verdi*. Mir Cəlal.

**TUTUQLUQ** *is.* Tutqunluq. *Havanın tutuqluğu. Səsin tutuqluğu*.

**TUTUQUŞU** *is.* 1. *zool.* Tropik və subtropik ölkələrin meşələrində yaşayan alabəzək rəngli quş; tutu.

2. *məc. dan.* Öz müstəqil fikri olmayıb başqasının fikrini, sözlərini təkrar edən adam haqqında.

◊ **Tutuquşu kimi ötmək (danışmaq)** – dilavərcə, səlis danışmaq, rəvan danışmaq. *Teymur baxır ki, bayaqdan tutuquşu kimi danışan vəzirlər, əyanlar Molla Nəsrəddini görcək lal oldular*. "M.N.lətif." [Şahmar:] *..Kinolarda min dəfə görmüşəm ki, sevən oğlanlar tutuquşu kimi ötürlər*. B.Bayramov.

**TUTULMA** 1. "Tutulmaq"dan *f.is.* [Valentinov:] *Tutulması çətindir. Gerisindən qorxmayın*. C.Cabbarlı.

2. *is.* Göy cisminin müvəqqəti olaraq başqa göy cismi ilə örtülməsi və ya başqa göy cisminin kölgəsində qalması. *Günəşin tutulması. Ayın tutulması.*

**TUTULMAQ** 1. "Tutmaq"dan *məch. Xəstəliyə tutulmaq.*

2. *f. məc.* Pərt olmaq, pozulmaq. *Zahidoğlu danışa-danışa qaralır, çox bərk tutulurdu*. S.Rəhimov.

3. *f.* Müvəqqəti olaraq başqa göy cismi ilə örtülmək və ya başqa göy cisminin kölgəsində qalmaq (göy cisimləri haqqında). *Ay* (*Günəş*) *tutulmaq*.

**TUTULMAZ** *sif.* Tutula bilməyən, ələ keçirilə bilməyən, tutulması, yaxalanması mümkün olmayan.

**TUTUM** *is.* Müəyyən qədər şeyi tutmaq, öz içərisində yerləşdirmək qabiliyyəti; həcm. *Sisternin tutumu.*

**TUTUMLU** *sif.* Müəyyən miqdarda şey tuta bilən; həcmli. *5 litr tutumlu neft qabı*. // Çoxlu miqdarda şey tutan; irihəcmli. *Tutumlu çən.*

**TUTUMSUZ** *sif.* Az şey tutan, tutumu kiçik olan; kiçikhəcmli. *Tutumsuz qazan*.

**TUTUŞDURMA** "Tutuşdurmaq"dan *f.is.*

**TUTUŞDURMAQ** *f.* Oxşar və fərqli cəhətlərini, yaxud bir şeyin o biri şeydən üstünlüyünü müəyyən etmək üçün onları qarşılaşdırmaq, müqayisə etmək. [Telli] *o gün Molla Xəlildən eşitdiyi sözlərlə əvvəlcə müəllimdən*

*eşitdiyi sözləri bir-birilə tutuşdururdu.* S.Hüseyn. *Rəis hesabı qurtarıb, onu kağızdakı rəqəmlə tutuşdurduqdan sonra qəddini düzəldərək astadan əsnədi.* İ.Əfəndiyev.

**TUTUŞMA** "Tutuşmaq"dan *f.is.*

**TUTUŞMAQ** 1. B a x **tutaşmaq**. [Nazlı] *bu saat Camalın qardaşı ilə tutuşacağını zənn edirdi.* Ə.Əbülhəsən.

2. Alışmaq, yanmağa başlamaq, alışıb-yanmaq. [Əsli:] *Ağa Kərəm, Paşa Kərəm, Xan Kərəm! Alış Kərəm, tutuş Kərəm, yan Kərəm!* "Əsli və Kərəm". [Tarxan:] *Uf, yanar odlara tutuşdum mən!* A.Şaiq.

3. Azacıq bərkimək, qurumaq; suyu çəkilmək. *Palçıq tutuşdu. – Sement tutuşub qurtardıqdan sonra bərkiməyə başlayır.* S.Quliyev.

4. *qarş.* Qurşaq yapışmaq, küştü tutmaq, güləşmək. *Dedi: – Olmaz ki, olmaz. – Xülasə, əlacım kəsildi, elə zorxanada tutuşduq.* Çəmənzəminli.

**TUTUZDURMA** "Tutuzdurmaq"dan *f.is.*

**TUTUZDURMAQ** *f. dan.* İlişdirmək, bərk vurmaq, çəkmək.

**TUTYA** *is.* [*ər.*] 1. *köhn.* Kimyəvi maddə – sink.

2. *məc.* Mövhumatçıların müqəddəs saydıqları hər hansı bir şey. *Xalq dalınca yüyürüşüb* [mollanın] *uzunqulağının ayaqlarının izindən torpaq götürüb tutya kimi evlərində saxlayırdılar*. Ə.Haqverdiyev.

**TUVACA** *sif.* və *zərf* Tuva dilində. *Tuvaca-rusca lüğət.*

**TUVALILAR** *cəm* Tuva Respublikasının əsas əhalisini təşkil edən xalq.

**TUZ** [*pol*. tuz, əsli *alm.* Dous] 1. Qumar kağızlarında: ortasında bir xal olan qiymətcə ən yüksək kart. *Xaç tuz.* – [Cəbi:] *Xeyr, olmaz, gərək tuz vuraq, kimə çıxsa o, bank qoysun.* S.S.Axundov.

2. *məc. dan.* Hər hansı bir mühitdə yüksək mövqe tutan nüfuzlu şəxs. *Maliyyə tuzları.* – [Rəşid:] *..Bu saat Bakının tuzları fəhləyə ləbbeyk deyir, o ki qaldı mən olam*. M.Hüseyn. // Hər hansı bir mühitdə şöhrət qazanmış, tanınmış şəxs. *Teatr tuzları. Tuzlar yığışıblar.*

**TÜCCAR** *is.* [*ər.* "tacir" söz. cəmi] *köhn.* Tacirlər. *Dedi: – Məşhur tacirəm məni-zar; Tanıyırlar məni hamı tüccar*. S.Ə.Şirvani. *Müsəlmanlardan xeyli camaat: nücəbadan, tüccardan və sair əsnafdan tamaşa üçün teatra toplaşdılar*. F.Köçərli.

**TÜFEYLİ** *is.* [*ər.*] 1. *biol.* Başqa orqanizmin üzərində və ya içində yaşayıb onun hesabına qidalanan bitki; parazit. *Bit camışın xüsusi tüfeylisidir*. A.Ağabəyli. // Sif. mənasında. *Tüfeyli bitkilər.*

2. *məc.* Başqasının zəhməti hesabına yaşayan adam; müftəxor, parazit. *Cəfər irəli yüyürüb tapançanı xozeyindən almaq, böhtan danışan və yalan şayiə yayan bu tüfeylini camaat içərisində ifşa etmək istədikdə tapança açıldı*. Ə.Vəliyev. *Beləliklə, Rüstəm bəyi əhatə edənlər ..cəmiyyətin tüfeyliləridir*. Ə.Sultanlı. // Sif. mənasında. *Tüfeyli siniflərin ləğv edilməsi. Tüfeyli həyat.*

3. *dan.* Söyüş kimi işlədilir. *Tüfeylinin biri.*

**TÜFEYLİLİK** *is.* 1. *biol.* Bir orqanizmin o biri orqanizmdən qida mənbəyi kimi istifadə etməsi; parazitlik, parazitizm.

2. *məc*. Başqasının əməyini istismar etmək hesabına yaşama; parazitizm, parazitlik. [Zərdabiyə] *elə gəlirdi ki, nəsihətlə bəyi, xanı, mollanı başa salmaqla, maarif və mədəniyyəti yaymaqla tüfeyliliyi yox etmək olar.* M.İbrahimov.

**TÜFƏNG** *is.* Uzun, ya qısa lüləli, əllə tutulub atılan odlu silah. *Ov tüfəngi. Qoşalülə tüfəng. Tüfəng atmaq. – Bəxtiyar tüfəngi doldurub qalxdı; Zilləyib gözünü bir az da baxdı.* S.Vurğun. [Qarakişi] *içəri girəndə əvvəlcə tüfənginin lüləsi göründü.* B.Bayramov.

**TÜFƏNGLİ** *sif.* Tüfəngi olan, tüfənglə silahlanmış. *Tüfəngli əsgər*. – [Uşaqlar] *tüfəngli fədai dəstələrinin nümayişini görərkən əvvəlcə bu nümayişləri də bundan əvvəl olan sadə nümayişlərdən biri hesab edirdilər*. Ə.Sadıq.

**TÜĞYAN** *is.* [*ər.*] Daşma, qabarma, qaynama, coşub-daşma. // *məc*. Həyəcan, təlatüm. □ **Tüğyan etmək** *məc.* – şiddət etmək, qaynamaq, coşmaq, azğınlıq etmək, qızışmaq. [Vaqif İbrahim xana:] *..Fətəli xan bir az çəkinirdi, indi qorxuram, o da tüğyan eləyə*. Çəmənzəminli. *Hava yenə də tüğyan elədi*. S.Rəhimov. **Tüğyana gəlmək** – b a x **tüğyan etmək**. *Coşdum zaman-zaman, gəldim tüğyana*. M.Rahim. *Qoca aşığın könlü sanki tüğyana gəldi*. Ə.Məmmədxanlı.

**TÜHAF** *sif.* [*ər.*] 1. Qəribə, görünməmiş, anlaşılmaz. *Tühaf hərəkət. Tühaf iş.* – [Rüstəm bəy] *bir-iki addım getməmiş tühaf bir mənzərəyə təsadüf etdi.* Çəmənzəminli.

2. Gülünc, güldürücü, məzhəkəli, əyləncəli. *Tühaf iş. Tühaf söhbətlər.*

**TÜK** *is.* 1. İnsan və heyvan dərisinin üstündə çıxan sapvari buynuz törəməsi. *Ağ tük.* – *Qurd tükünü dəyişər, xasiyyətini dəyişməz.* (Ata. sözü). [Qarovulçunun] *üzündəki seyrək tüklər biz-biz durmuşdu.* M.Hüseyn. // Saç. *Qulunun başının tükləri, qaşları və kirpikləri xına rəngində idi.* M.İbrahimov.

2. Heyvanların müxtəlif məqsədlər üçün istifadə edilən yunu, qılı. *Keçi tükündən toxunmuş örkən.* – *Ələklər ipək sapdan, tükdən, bürünc və ya polad məftildən hazırlanır.* R.Əliyev. ◻ **Tük güllə** – tir tüfəngindən atılan, arxa tərəfində tük olan güllə. *Avtomata dönmüş cavab, tirdə atılan tük güllə kimi yenə qanadlanıb düz hədəfin ortasına yapışdı.* B.Bayramov.

3. Quşların bədənini örtən belə yumşaq və incə tellər. ..[Martı quşları] *öz tüklərini tumarlayırdılar.* H.Seyidbəyli. // Kəsilmiş quşların, balış və s. üçün işlədilən çıxarılmış pəri; pərqu. *Balış üçün tük almaq. Qu tükü.* // İçində pər olan, içinə pərqu doldurulmuş. *Tük balış.*

4. Bəzi meyvələrin və ya yarpaqların üzərində, yaxud da altında olan xırda tükcüklər; xov. *Gicitkənin tükləri.*

5. Hər hansı bir mexanizmdə, cihazda və s.-də incə sap, yay, məftil və s. *Saat mexanizminin tükü. Elektrik lampasının tükü.*

◊ **Tük qədər** – zərrə qədər, heç, qətiyyən. *Tük qədər qorxmamaq.* **Tük salmaq (tökmək)** – bərk qorxmaq, dəhşətə gəlmək, dəhşətlənmək. *Tük tökər məndən paşalar; Xotkarlar çəkər haşalar.* "Koroğlu". [Qurd Kərim:] *Səlim bəy nə qədər güclü olsa da, Nəbidən tük salır.* S.Rüstəm. **Tükdən asılı olmaq** – qorxulu, ümidsiz vəziyyətdə olmaq, ölüm ayağında olmaq. **Tükləri biz-biz durmaq (olmaq)** – dəhşət götürmək, bərk qorxmaq. *Elə bir hala düşərsən ki, tükün biz-biz olar; Əyninə geyməyə şey tapmasan; astar üz olar!* M.Ə.Sabir. *İndi də bu hadisə yadıma düşəndə tüklərim biz-biz durur.* S.S.Axundov. **Tükləri qabarmaq (qalxmaq, ürpərmək)** – b a x **tükləri biz-biz durmaq (olmaq)**. *Pələngdən elə bir bağırtı qopdu ki, səsindən dam-daş titrədi. Gözlərim qaraldı. Tüklərim ürpərdi.* A.Şaiq. [Nənəqız] *elə ağı deyir ki, adamın başının tükləri qabarır.* S.Rəhimov. **Tükü tərpənməmək** – halına qətiyyən təsir etməmək. *Rəhim bəyin sözlərini dinlədikcə Bayramın tükü də tərpənmirdi.* M.Hüseyn. **Tükü tükdən seçmək** – ən incə mətləbi başa düşmək, tez başa düşmək. *Vəzirlər həmişə gərək tükü tükdən, sözü sözdən seçsinlər.* (Nağıl). [Qubernator:] *Diplomat tükü tükdən seçər.* C.Cabbarlı. **Tükü yatımına sığallamaq** *məc.* – bir işi yaxşılıqla, mübahisəsiz yola vermək. [Rəhimli:] *..Mən həmişə tükü yatımına sığallayıram, inciyən adam deyiləm.* İ.Hüseynov. **Tükünü (tüklərini) didmək** – divan tutmaq, cəza vermək, cəzalandırmaq. [Oddamdı:] *Vay,* [ərəblər] *mənim cücə kimi tüklərimi didəcəklər.* C.Cabbarlı.

**TÜKBAŞ** *sif.* Başına heç bir şey örtməmiş; başaçıq. *Tükbaş qız.*

**TÜKCƏ** *sif.* və *zərf* Tük qədər, zərrə qədər, qətiyyən, əsla. [Kərbəlayı Qubad:] *Vallah, səni mən tükcə incitmərəm!* Ü.Hacıbəyov.

**TÜKCÜK** *is.* İncə, zərif, xırda tük. *Yarpağın tükcüyü.*

**TÜKƏNDİRMƏ** "Tükəndirmək"dən *f.is.*

**TÜKƏNDİRMƏK** *f.* Hamısını işlədib qurtarmaq, sərf edib qurtarmaq, axırına çıxmaq. ◻ **Səbrini tükəndirmək** – b a x **səbir kasasını doldurmaq** ("**səbir**"də). *Rüstəm kişi tutuldu, Telli arvadın susmaq bilməyən dili onun səbrini tükəndirdi.* M.İbrahimov.

**TÜKƏNMƏ** "Tükənmək"dən *f.is.*

**TÜKƏNMƏK** *f.* Qurtarmaq, bitmək, tamamilə işləyib qurtarmaq, daha qalmamaq. *..Kənddən çıxdıqlarının onuncu günü Səriyyə xala yemək ehtiyatının tükənməyə başladığını hiss etdi.* M.İbrahimov. *Yusifgilin kənardan çəkib gətirdikləri ələf də tükənirdi.* B.Bayramov. // Sona çatmaq, bitmək, qurtarmaq. *Ömrün tükənib oldu nəhayət şəbi-vəslin.* S.Ə.Şirvani.

**TÜKƏNMƏZ** *sif.* Tükənməyən, bitməyən, bitməz, qurtarmayan, qurtarmaz, çox, saysız-hesabsız. *Dağlardan axıb gələn çay suyu .. yaşıl bağlar üçün tükənməz bir həyat*

*mənbəyidir*. M.İbrahimov. *Alın tərilə əkən, biçən; İnsanların fərəhi, sevinci tükənməzdir!* N.Rəfibəyli.

**TÜKƏTMƏ** "Tükətmək"dən *f.is.*

**TÜKƏTMƏK** *f.* Axıra çatdırmaq, bitirmək, sona çatdırmaq. [Şah Abbas:] *Tükətdi ömrümü zindan, yox oldu səbrü-qərar*. Ü.Hacıbəyov.

**TÜKLƏNMƏ** "Tüklənmək"dən *f.is.*

**TÜKLƏNMƏK** *f.* 1. Üzünə tük çıxmaq, tük gəlmək, tük basmaq. *Cavadın mülayim və mehriban rəftarını gördükdən sonra* [uşaq] *da əllərini Cavadın tüklənmiş* (f.sif.) *üzündə gəzdirməyə başladı*. Ə.Vəliyev.

2. Tük çıxarmaq, tük əmələ gəlmək (quş balası, cücə və s. haqqında). *Şəhərdən gətirdiyim toyuğumun cücələri böyümüş, tüklənmiş, xoruzu, fərəsi bəlli olmuşdu.* A.Şaiq.

**TÜKLÜ** *sif.* 1. Tükü olan, bədəni tüklə örtülü, tük basmış. *Xanməmməd üstü tüklü burnunu çəkə-çəkə içəri girdi.* Çəmənzəminli. [Nəriman] *..şapkasını təkyənin üstünə ataraq ağ, tüklü biləklərini çirməyib əlüzyuyana yaxınlaşdı*. İ.Əfəndiyev. // Üzü qırxılmamış, üzünü tük basmış. *Tüklü üz. – Fərhad gözlərini açanda yaş damcıları tüklü sifətinə axdı.* Ə.Vəliyev. // Qıllı. *Tüklü heyvan*.

2. Tüklü dəridən tikilmiş. *Tüklü kürk*. – [Məşədi Əhməd] *evdə işlər, qoyun və quzu dərisindən tikdiyi tüklü papaqları bazarda və meydanda satardı.* S.Hüseyn.

3. Tükü olan (b a x **tük** 4-cü mənada). *Tüklü heyvan. – Bu toxumlardan yetişən sağlam, yarpaqları tüklü olan gözəl şitillər inkişaf etdi.* M.Axundov.

**TÜKLÜLÜK** *is.* Tüklü olma, qıllılıq.

**TÜKLÜPAPAQ** *sif.* Başında tüklü dəridən tikilmiş papaq olan. *Tüklüpapaq, ayaqyalın birisi daxil olub, bir stul gətirdi.* T.Ş.Simurq.

**TÜKSÜZ** *sif.* 1. Tükü olmayan, qılsız. *Tüksüz dəri.*

2. Üzünə hələ tük gəlməmiş (yeniyetmə oğlan haqqında). // Üzü qırxılmış, üzündə tük olmayan. *Rəhimlinin qıyıq gözlərindən silinməyən təbəssüm qızartısı çəkilməyən, yumru, ətli, tüksüz sifətinə yaraşıq verirdi*. İ.Hüseynov.

3. Tükü olmayan (b a x **tük** 4-cü mənada). [Pambığın] *bütün hissələri, ya azca tüklü, ya da tamam tüksüz olur.* "Pambıqçılıq".

**TÜKÜGÖDƏK** *sif.* Tükləri qısa olan; qısatüklü.

**TÜKÜRPƏRDƏN, TÜKÜRPƏRDİCİ** *sif.* Adamın tüklərini ürpərdən, çox ağır, sarsıdıcı, dəhşətli. *Tükürpərdən* (*tükürpərdici*) *mənzərə. – Daşürəkli keşikçilər belə* [xanın] *tükürpərdən bir səslə: "Oğul... Buğac!.." fəryadını eşidəndə sarsılırdılar.* M.Rzaquluzadə.

**TÜL** [*fr.* tulle] Çox vaxt güllü naxışları olan yüngül, toraoxşar şəffaf parça. *Pərdəlik tül.* // Həmin parçadan tikilmiş. *Tül kofta. – Açıq pəncərədən tül pərdə asılmışdı*. İ.Hüseynov.

**TÜLƏK** *sif.* Tükünü, yununu tökmüş. *Tülək tərlan*. – [Çopo:] *Bir dəfə də tülək şahinə rast gəldim, hasarın üstündə oturub dimdiyini daşa sürtürdü.* Çəmənzəminli.

**TÜLƏMƏ** "Tüləmək"dən *f.is.*

**TÜLƏMƏK** *f.* Müəyyən vaxtlarda köhnə tükünü, yununu, qabığını tökmək, təzələmək (heyvanlar və quşlar haqqında). [Çopo:] *Beş addım o yanda tükünü tüləmiş* (f.sif.) *qoca və çəlimsiz bir köpək yatmışdı*. Çəmənzəminli. *At gündən-günə tükünü tüləyir, kökəlir, sağrısı düzəlirdi*. Ə.Vəliyev.

**TÜLKÜ** *is.* 1. *zool.* İtlər ailəsindən, uzunsifət, uzuntüklü, quyruqlu yırtıcı məməli heyvan. *Boz tülkü. – Tülkü gəzər ikən oldu bir qurda düçar.* Q.Zakir. *Elə bu anda yanımdakı iri böyürtkən kolundan bir tülkü çıxaraq düzlərə sarı götürüldü.* İ.Əfəndiyev.

2. *məc.* Hiyləgər, bic, kələkbaz, yaltaq adam haqqında. *Yaman tülküdür*. – [Xart:] *Bu baş vəzir cənabları qoca tülküdür*. Ə.Məmmədxanlı. // *məc.* Qorxaq, ağciyər adam haqqında. *Aslanam, deyiləm tülkü; Tanımaram qorxu, hürkü*. "Koroğlu". [Ataş:] *Qaçayla Ataş olan yerin həndəvərinə Kəngərli kimi tülkülər hərlənə bilməz*. Ə.Vəliyev.

**TÜLKÜDURMAZDAN** *zərf* Səhər tezdən, alaqaranlıqdan, sübhçağı. *Sabah tülküdurmazdan Gülməmməd dağa yollandı.* Ə.Vəliyev.

**TÜLKÜXASİYYƏT(Lİ)** *sif.* Bic, hiyləgər, kələkbaz, yaltaq.

**TÜLKÜQUYRUĞU** *is. bot.* Süpürgəvari çiçək qrupu olan yem bitkisi – ot.

**TÜLKÜLÜK** *is.* Hiyləgərlik, kələkbazlıq; hiylə, biclik. *Bu Məhbub xanımda bir tülkülük var*. "Koroğlu".

◊ **Özünü tülkülüyə vurmaq (qoymaq)** – biclik etmək, yaltaqlanmaq, hiyləbazlıq etmək.

**TÜLKÜSİFƏT(Lİ)** *sif.* Sifəti tülkü sifətinə oxşayan, tülküsima adam haqqında. *..Başının ortası dazlaşmış, tülküsifət bir adamın nitqi Tahiri yaman qəzəbləndirdi.* M.Hüseyn.

**TÜLLAB** *is.* [*ər.* "tələbə" söz. cəmi] 1. *köhn.* Ruhani məktəbində oxuyan tələbələr. *Şeyx Əbu Səid gecələr əvvəli-təbdə tüllaba dərs verərdi.* M.F.Axundzadə. *Məsələ məscid hücrələrində yaşayan tüllab arasında da atəşli münaqişə və mübahisəyə səbəb oldu.* Çəmənzəminli.

2. *məc.* Yüngül, dəmdəməki, lotu-bambılı adam haqqında. *Tüllabın biridir.*

**TÜLLABLIQ** *is.* 1. *köhn.* Tələbəlik (dini məktəb tələbəliyi).

2. *məc. dan.* Yüngüllük, ciddiyyətsizlik, ləyaqətsizlik, vecsizlik, bambılılıq. *Bəsdir tüllablıq elədin.*

**TÜLU** *is.* [*ər.*] 1. Doğma, çıxma, zühur etmə (Günəş haqqında). ◻ **Tülu etmək (eyləmək)** – doğmaq, çıxmaq, zühur etmək (Günəş). *Gün tülu etdi üfüqdən, yerə taban gəliri.* Heyran xanım. *Gün tülu etdi, ucaldı fələkə; Ufacıq biz demə yatdıq bu gecə!* Ə.Nəzmi. // Dan yeri sökülən vaxt, sabah açılan vaxt, sübh işıqlanan vaxt. *Sübhün tüluunda gecələmiş çil xoruz oyanıb, uca və zil səslə banladı.* S.S.Axundov.

2. *məc.* Başlanğıc, ibtida, törəniş; çıxma, zahir olma. *Günün ömrü öz vaxtında uzanır; Öz vaxtında gödəlir; Həyatın tüluu da; Bu qanuna düz gəlir.* B.Vahabzadə.

**TÜMƏN** *is.* 1. İranda: 10 riala bərabər pul vahidi. [Xortdan:] *Rəştə teleqram çəkib, beş min tümən pul istədi.* Ə.Haqverdiyev. [Səttarxan:] *Bəs bunun 210 tümənini kim verir?* M.S.Ordubadi.

2. *qəd.* On min.

**TÜNBƏTÜN** [*fars.*] Söyüş məqamında işlənən söz. [Hacı Qənbər:] *Tünbətünün qızı, sürün buradan!* N.Vəzirov. ◻ **Tünbətün olsun (düşsün)** – söyüş, qarğış, lənət məqamında işlənən ifadə. [İzzət:] *Atana lənət, Xudayar bəy! Anana lənət, Xudayar bəy! Dədən tünbətün düşsün, Xudayar bəy!* C.Məmmədquluzadə. [Ocaqqulu:] *Qatırı axsaq olanın atası tünbətün olsun!* C.Cabbarlı.

**TÜND** *sif.* [*fars.*] 1. Rəngi açıq olmayan, qaraya yaxın olan, tutqun. *Tünd paltar. Tünd rəng.* // Qəliz, kəsif, tərkibində çoxlu miqdarda həll olmuş maddələr olan. *Tünd qəhvə. Tünd məhlul. – Qüdrət xörəyini həris bir iştaha ilə cəld yeyib, üstündən də iki stəkan tünd çay içdi.* M.Hüseyn. *Yaqub .. dəmlənmiş tünd çayı ləzzətlə içməyə başladı.* S.Vəliyev.

2. Hiss orqanlarına bərk təsir edən; kəskin. *Tünd tütün. – Yenə də üz-üzə deyə qalxaraq; İçirtdi dostları ona tünd araq.* M.Rahim. *Gəmi sahibi bir yandan içdiyi bol müftə və tünd şərabın, bir yandan da on qat artıq aldığı pulun nəşəsi ilə sərməst idi.* M.Rzaquluzadə.

3. *məc.* Bərk, iti, becid. *Tünd at. – Məstan da özünə görə göyçəkdi, amma sağ topuğundan, tünd* (z.) *yeriyəndə bir balaca axsaqlığı vardı.* (Nağıl).

4. *məc.* Hirsli, acıqlı, ağırxasiyyətli, tündməzac, ağır. *Tünd adam.* – [Əziz bəy:] (Tünd halda) *Səkinə xanım, axır mənim günümü bu yerə yetirdin!* M.F.Axundzadə. [Sultan:] *Yoldaşlardan biri mənə dedi, eşitmişik, xasiyyətin bir az tünddür, buna görə də raykoma müvəqqəti göndəririk.* İ.Hüseynov. ◻ **Tünd olmaq** – hirslənmək, qəzəblənmək, acıqlanmaq, hiddətlənmək, qanı qaralmaq. *Səni görcək özün soxar içəri; Tünd olub qapını bidəmaq çəkər.* Q.Zakir.

5. *məc.* Bərk, şiddətli, güclü, qatı. *..Cənab şəriətmədar küçə ilə gedərkən bir tünd yel əsdi. Axundun əmmaməsi düşdü yerə.* "Mol. Nəsr."

◊ **Tünd getmək** *məc.* – ifrata varmaq, şişirtmək. *Salman Şirzadı danışmağa qoymayıb dedi: – Yoldaş Şirzad çox tünd gedir, nöqsanları şişirdir!* M.İbrahimov.

**tünd**... [*fars.*] Mürəkkəb rəng adlarının, onların açıq olmadığını, qaraya yaxın olduğunu göstərən tərkib hissəsi; məs.: tünd-qara, tünd-sarı, tünd-yaşıl, tünd-qəhvəyi, tünd-göy və s.

**TÜNDXASİYYƏT(Lİ)** *sif.* Tez hirslənən, tez özündən çıxan, tez coşan, tündməzac. [Sultan:] *..Mən rayona qayıdanda birinci işim bu oldu ki, ətrafıma özüm kimi tündxasiyyət adamları yığdım.* İ.Hüseynov. *Əvvəllərdə də elə bir az tündxasiyyət olan Mahmud axır vaxtlar lap dəyişmişdi.* Y.Əzimzadə.

**TÜNDXASİYYƏT(Lİ)LİK** *is.* Tündməzac adamın xasiyyəti; tez özündən çıxma, coşma; tündməzaclıq.

**TÜNDLƏŞMƏ** "Tündləşmək"dən *f.is.*

**TÜNDLƏŞMƏK** *f.* 1. Rəngi tünd olmaq; tutqunlaşmaq, qəlizləşmək. *Abışın rəngi tündləşdi*. B.Bayramov.

2. Kəsifləşmək, qəlizləşmək, qatılaşmaq, kəskinləşmək, artmaq. *Havada tündləşir barıt qoxusu; Berlinin üstündə ölüm yuxusu*. S.Vurğun.

3. *məc.* Hirslənmək, qəzəblənmək, acıqlanmaq, qızmaq, qızışmaq. *Yeri gələndə tündləşən* (f.sif.) *qocanın xasiyyətinə Qəhrəman yaxşı bələd idi*. S.Rəhimov. *İsi dayı Səməndərin tündləşdiyini görüb, araya sülh qoymağa çalışdı*. B.Bayramov.

4. *məc.* Güclənmək, şiddətlənmək, gücü, şiddəti daha da artmaq. *Elə bil hava istiləşib bürkü tündləşdikcə milçək artırdı.* Ə.Əbülhəsən.

**TÜNDLÜK** *is.* 1. Rəngi tünd olan şeyin halı; tünd olma, tutqun olma, tutqunluq. *Rəngin tündlüyü*.

2. Kəsiflik, qəlizlik, qatılıq, kəskinlik. *Qoxunun tündlüyü*.

3. Tünd olma dərəcəsi; bərklik, qəlizlik. *Şərabın tündlüyü. Tütünün tündlüyü.*

4. *məc.* Xasiyyətcə ağırlıq, tündməzaclıq; tez hirslənmə, tez özündən çıxma xasiyyəti. *İmanovun xasiyyətində nə isə bir tündlük vardı.* M.Hüseyn.

**TÜNDMƏZAC** [*fars.* tünd və *ər.* məzac] b a x **tündxasiyyət(li)**. *Məşədi Qulam ev daxilində çox tündməzac idi*. T.Ş.Simurq. *Çünki Çərkəz həddindən artıq zarafatcıl, aşıq isə tündməzac idi*. İ.Əfəndiyev.

**TÜNDMƏZACLIQ** b a x **tündxasiyyət(li)-lik**. [Köməkçi] *Xoruzoğlunun tündməzaclığından və adam döyməyindən bərk çəkinirdi.* S.Rəhimov.

**TÜNDRƏNGLİ** b a x **tünd** 1-ci mənada.

**TÜNLÜK** *is.* Qələbəlik, adam çox olan yer, basabas. *Sahənin o biri briqadasının üzvləri də buraya gəldikləri üçün çardağın altında əməlli-başlı tünlük idi.* Ə.Əbülhəsən. *Artyom adasındakı ovlaqda xüsusən istirahət günləri çox tünlük olur*. M.Rzaquluzadə.

**TÜNÜK** *sif. dan.* Nazik, zəif. *Tünük taxta. Tünük bez*.

**TÜNÜKLÜK** *is. dan.* Tünük şeyin halı; naziklik. *Parçanın tünüklüyü*.

**TÜPÜRCƏK** *is.* Ağızdan tüpürülən ağız suyu; bəlğəm.

◊ **Tüpürcəyi qurumaq** *məc.* – bərk qorxmaq, qorxu keçirmək. *Keçəl Həmzənin tüpürcəyi qurudu*. "Koroğlu". **Tüpürcəyini yalamaq** – b a x **tüpürdüyünü yalamaq** ("**tüpürmək**"də). [Məzlum:] *Mən tüpürcəyimi yalayan deyiləm.* S.Vəliyev.

**TÜPÜRCƏKQABI** *is.* İçinə tüpürmək üçün qab. *Xəstənin ayrıca cib və üz dəsmalı, qabqacağı, tüpürcəkqabı olmalıdır.*

**TÜPÜRCƏKLƏMƏ** "Tüpürcəkləmək"dən *f.is.*

**TÜPÜRCƏKLƏMƏK** *f.* Tüpürcəyə batırmaq, tüpürcək sürtmək.

**TÜPÜRMƏ** "Tüpürmək"dən *f.is.*

**TÜPÜRMƏK** *f.* 1. Ağız suyunu, bəlğəmi, tüpürcəyi və s.-ni ağzından rədd etmək, atmaq. *Xanlar .. ovcuna tüpürüb, lopatkanı torpağa batırdı.* M.Hüseyn. *Musa kişi demisindən dərin bir qullab alaraq kənara tüpürdü.* İ.Əfəndiyev.

2. **Tüpürüm (tüpürəsən)** şəklində – bir şeyə, ya şəxsə qarşı tam etinasızlığı, laqeydliyi, saymazlığı ifadə etmək üçün işlədilir.

◊ **Tüpürdüyünü yalamaq** – əvvəl dediyi sözdən, verdiyi vəddən, razı olduğu bir şeydən, əvvəlki qərarından imtina etmək; sözünün üstündə durmamaq, sözündən qaçmaq. [Telli Rüstəmə:] *Sən özün öz abrını aparmısan, mən niyə? Bir sədr ki tüpürdüyünü yalaya, onda abırmı qalar?* M.İbrahimov. **Dabanına tüpürmək** – b a x **daban**.

**TÜRBƏ** *is.* [*ər.*] Qəbir, məzar. // Böyük, yaxud müqəddəs sayılan şəxslərin qəbirləri üzərində tikilən və sonradan çox vaxt ziyarətgah olan bina; məqbərə, mavzoley. *Qızıl Arslan İraqdakı türbələri ziyarət edəndən sonra Bağdada qayıtdı*. M.S.Ordubadi. *Biz Nizaminin türbəsinə çatarkən yuxarı dağların zirvəsindən qapqara bir bulud parçası qopub, günün qabağını tutan buludla birləşdi.* İ.Əfəndiyev.

**TÜRBƏT** *is.* [*ər.*] 1. Torpaq. *Elə bir ölkədə doğulmuşam ki; Onun türbətinə minnətdaram mən*. M.Rahim. // *məc.* Müqəddəs torpaq. *Ana torpağından bir ovuc alıb; Vətən türbəti tək gəzdirən ərlər.* N.Xəzri.

2. Keçmişdə: dindarların müqəddəs saydıqları yerlərdən, müqəddəslərin qəbrinin üstündən, pirlərdən və s.-dən götürülən torpaq. [Xortdan:] *Bu türbətin təlatüm yatırtması dəfəatla imtahan olunubdur*. Ə.Haqverdiyev.

**TÜRFƏ** *sif.* və *zərf* [*ər.*] *klas.* Zərif, incə, füsunkar, məlahətli, qəşəng. *Zar ağlar ikən bu rəsmə ol mah; Bir türfə səda eşitdi nagah.* Füzuli. *Tazə gəlin kimi bəzəndi Bakı; Çox türfə bəzənib-düzəndi Bakı*. Ə.Cavad.

**TÜRFƏTÜLEYN** *zərf* [*ər.*] *klas.* Göz açıb yumunca, bir göz qırpımında, bir anda, bir an içində, dərhal. *Türfətüleyndə cəlladi-mühib belində xəncər, əlində tənab içəri girdi*. M.F.Axundzadə.

**TÜRK** *is.* Türkiyənin əsas əhalisini təşkil edən və türk dillərindən birində danışan xalq və bu xalqa mənsub adam.

◊ **Türk demişkən, türkün sözü** – “necə deyərlər” mənasında ara söz kimi işlənir. [Babakişi Sevilə:] *Bu il, qızım, türkün sözü, nəmişlik olmadı, ..mən də borca düşmüşdüm.* C.Cabbarlı. **Türk dilləri** – müxtəlif türk xalqları dillərinin daxil olduğu dil qrupu.

**TÜRKCƏ** *sif.* və *zərf* Türk dilində. *Türkcə öyrənmək. Türkcə-rusca lüğət*.

**TÜRKƏÇARƏ** *is.* Xalq təbabətinin müalicə üsullarından biri; arahəkimliyi. *Evdə Xanpəri, Gülpəri, Fatmanisə yığılıb, uşağın dərdini başa düşməzdilər, olmazın türkəçarə davaları ilə bu uşağın qarnını doldurardılar*. H.Sarabski. [Dükançının] *üstəlik türkəçarə ilə məşğul olan fırıldaqçı bir bacanağı vardı.* Ə.Vəliyev. □ **Türkəçarə etmək** – türkəçarə yolu ilə müalicə etmək. [Məmmədin] *arvadı Banuxanım əri üçün yer salıb, türkəçarə eləməyə başladı*. “Aşıq Qərib”. [Rəşid:] *Bir qədər türkəçarə edəndən sonra, belə məlum olur ki, guya Qurbanqulunun bacısı qorxmuş*(*dur*). T.Ş.Simurq.

**TÜRKƏÇARƏÇİ** *is.* Keçmişdə: xəstəni türkəçarə yolu ilə müalicə edən adam; arahəkimi.

**TÜRKƏSAYA(Q)** *sif. dan.* Sadədil, sadəlövh, biclik bilməyən, ürəyisadə (bəzən “avam” mənasında işlənir). *Türkəsaya qoca*. – [Həsən:] [Zəhra] *yazıq, türkəsaya adamdır*. M.İbrahimov.

**TÜRKƏSAYA(Q)LIQ** *is.* Türkəsayaq adamın xasiyyəti; sadədillik, sadəlövhlük, ürəyisadəlik (bəzən “avamlıq” mənasında işlənir). *Rüstəm kişi sədrin fikrini axıra qədər bilmək üçün özünü türkəsayalığa vurdu.* M.İbrahimov.

**TÜRKMƏN** *is.* Türkmənistanın əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

**TÜRKMƏNCƏ** *sif.* və *zərf* Türkmən dilində. *Türkməncə dərs kitabı. Türkməncə danışmaq*.

**TÜRKOLOGİYA** *is.* Türk dillərini və ədəbiyyatlarını, folklorunu öyrənən elmlərin bir yerdə adı.

**TÜRKOLOJİ** *sif.* Türkologiyaya aid olan, türkologiya ilə əlaqədar olan.

**TÜRKOLOQ** *is.* Türkologiya mütəxəssisi.

**TÜRKÜ** *is. klas.* Mahnı, nəğmə, şərqi. *O yerdə ki quşlar oxur, söylənilən türkülər; Andırır ki, o torpağın zəngin təbiəti var.* S.Vurğun. *Oxuduğum türkülərin kölgəsidir övladım; Mənə məxsus vərəqlər var hər kitabda, hər dildə.* M.Müşfiq.

**TÜSTÜ** *is.* 1. Yanan bir şeydən havaya qalxan dumanaoxşar qazvari kəsif zərrəciklər. *Papiros tüstüsü. Qara tüstü. – O taydan bu taya işıqlar gəlir; Tüstülər burulub göyə yüksəlir*. S.Vurğun.

2. *tar.* Keçmişdə vergi vahidi kimi götürülən ev, təsərrüfat. *O zaman bu kənddə cəmicümlətanı 15-20 tüstü var idi*. S.Rəhimov.

◊ **Başından (təpəsindən) tüstü çıxmaq** – b a x **baş**.

**TÜSTÜLƏMƏ** “Tüstüləmək”dən *f.is.*

**TÜSTÜLƏMƏK** *f.* 1. Tüstü vermək, çoxlu tüstü buraxmaq, tüstüsü çıxmaq. *Yenə trubka tüstülədi..* M.İbrahimov. *Nə tüstüləyib gedən qatarlar, nə sürətlə ötən maşınlar bu məxluqa baxmırdı*. Mir Cəlal.

2. Yaxşı yanmamaq, közərib tüstülənmək, alışıb-yanmamaq, sönmək üzrə olmaq. *Kösöv tüstüləyir*.

3. B a x **tüstüləndirmək**. *Papirosunu tüstüləmək.*

**TÜSTÜLƏNDİRMƏ** “Tüstüləndirmək”dən *f.is.*

**TÜSTÜLƏNDİRMƏK** *f.* Papiros, qəlyan və s. çəkərkən tüstü buraxmaq, tüstü ilə

doldurmaq (bir yeri). *Otağı yaman tüstüləndiriblər. – Musa qəlyanını tüstüləndirirdi*. M.Hüseyn.

**TÜSTÜLƏNMƏ** "Tüstülənmək"dən *f.is.*

**TÜSTÜLƏNMƏK** *f.* Tüstü buraxmaq, tüstüsü çıxmaq, tüstülənmək. *Kəndçi də söylənir: – Ədalət hanı? Yanıb tüstülənir ağac qəlyanı*. S.Vurğun. *Ocaq tüstülənir... o fikirlidir; Uşaqlıq çağımı yadına düşdü?* H.Hüseynzadə. // Tüstü ilə dolmaq, tüstü qalamaq. *Otaq bərk tüstülənib*. // Alovsuz yanmaq, zəif yanmaq, alışmadan yanmaq, közərmək. *Fitil tüstülənir. Kömür tüstülənir*.

**TÜSTÜLƏTMƏ** "Tüstülətmək"dən *f.is.*

**TÜSTÜLƏTMƏK** *f.* Tüstülənməsinə səbəb olmaq, tüstü çıxmasına kömək etmək; tüstüləndirmək, tüstüləmək. *Qoca bağban.. qaşqabağını turşudub, demisini çəkdi və tüstülətdi*. S.Rəhimov.

**TÜSTÜLÜ** *sif.* 1. Tüstü verən, tüstüsü çıxan. *Tüstülü ocaq*.

2. Tüstü basmış, tüstü dolmuş, tüstü qaplamış, tüstü ilə dolu. *Yenə də küy qopdu tüstülü zalda; Yenə şüşələrdən daşdı şərablar*. N.Xəzri.

3. İçərisindən tüstü çıxan. *Yenicə puçurlamış ağacların, söyüd salxımlarının arasında damların tüstülü bacaları görünür*. Mir Cəlal.

**TÜSTÜSÜZ** *sif.* 1. Tüstüsü olmayan, tüstü çıxmayan, yanarkən tüstü verməyən. *Tüstüsüz barıt*.

2. İçərisindən tüstü çıxmayan; yanmayan. *Tüstüsüz damlar; Sarı badamlar; Tənbəl adamlar; Bu balama qurban.* (Layla).

◊ **Tüstüsüz yanmaq** *məc.* – yanıb-qovrulmaq. *Yaxşı saxlaya bilmir öz rolunu yadında; Yanır, tüstüsüz yanır qısqanclığın odunda*. S.Rüstəm.

**TÜTƏK** *is.* Qarğıdan və s.-dən qayrılmış nəfəsli xalq musiqi aləti. *Tütək çalmaq. – Çoban anar səni, tütəyi sızlar; Ellər toy eləməz, yolunu gözlər.* Ə.Cavad. *Ayna bir müddət uzaqdan gələn tütək səsinə qulaq verdi.* Ə.Məmmədxanlı.

◊ **Tütəyin dilini (içəri) çəkmək** – danışığını kəsmək, susmaq, dinməmək. [Zeynal:] *..Biz tütəyin dilini çəkməyə məcbur olduq*. Ə.Əbülhəsən. *Şahpəri Sərvnaz qarının qırımını görüb, tütəyin dilini çəkdi*. B.Bayramov.

**TÜTƏKÇALAN, TÜTƏKÇİ** *is.* Tütək çalan musiqiçi.

**TÜTMƏ** "Tütmək"dən *f.is.*

**TÜTMƏK** *f.* Yanmaq, tüstüsü çıxmaq. *Orda-burda ocaq tütür, evlər çıraq yandırır; Uçan durna, sönən qürub nağılları andırır.* Ə.Cəmil.

**TÜTÜN** *is.* 1. Yarpaqlarında nikotin olan quşüzümü ailəsindən ot-bitki. *Tütün zəmisi. Tütün yığımı. – Ağacların qalın gövdələri arasından yaşıl tütün plantasiyası görünür, çöldə işləyən qızların mahnısı ucalırdı.* H.Seyidbəyli. *Tütün ən çox papiros istehsalı üçün becərilir.* H.Qədirov.

2. Həmin bitkinin papiros çəkmək, iyləmək və ya çeynəmək üçün işlədilən qurudulmuş və xırda doğranmış və ya ovulmuş yarpaqları. *Siqaret tütünü. Əla növ tütün.* □ **Tütün çəkmək** – papiros (siqaret) çəkmək. *O deyir: – Havada deyil bu mümkün; Döyüş zamanları çəkəsən tütün.* M.Rahim.

3. Tüstü. *Oturdu diz-dizə qaçaqlar bütün; Çadırı doldurdu şərabla tütün*. S.Vurğun.

◊ **Başından (təpəsindən) tütün çıxmaq** – bax **başından (təpəsindən) tüstü çıxmaq** ("**tüstü**"də).

**TÜTÜNÇÜ** *is.* Tütün əkib-becərməklə məşğul olan adam. *Povestin mövzusu Azərbaycan tütünçülərinin həyatından götürülmüşdür.*

**TÜTÜNÇÜLÜK** *is.* Kənd təsərrüfatının, sənaye məqsədləri üçün tütün bitkisi əkib-becərməklə məşğul olan sahəsi; ümumiyyətlə, tütün becərmə işi. *Tütünçülük briqadası.*

# Uu

**U**[1] Azərbaycan əlifbasının iyirmi səkkizinci hərfi və bu hərflə işarə olunan saitin adı.

**U**[2] *nida.* 1. Uğultu səsinə təqlid kimi işlənir (adətən uzadılaraq deyilir – u-u-u-u, u-u-u). *Uzaqdan u-u səsi gəldi.*

2. Səbirsizlik, hövsələsizlik, narazılıq yaxud da inciklik, tənə və s. hissləri ifadə edir. *U! Bu heç yaxşı olmadı. U! Qulağımız dəng oldu.*

3. Hürkmə, diksinmə, yaxud təəccüb ifadə edir. *U! İlana bax! U! Nə dərin quyudur! U! Nə gözəldir!*

**UC** *is.* 1. Bir şeyin sivri, şiş, nazik, batıcı tərəfi, kənarı. *İynənin ucu. Mıxın ucu. Süngünün ucu. – Bekar yabanın ucunda bir çəngə alovlu tikan götürüb, bayraq kimi göyə qaldırmışdı.* Mir Cəlal. *Səlim qələmin ucunu akta söykəyib oğluna dik baxdı.* B.Bayramov. // Parçanın, paltarın və s.-nin bucaq şəklində olan hissəsi, kənarı. *Ətəyin ucu. Brezentin ucu. Xalçanın bir ucundan yapışmaq. – Kərim baba da palazın bir ucunda Ayrım qızı ilə yan-yana oturdu.* A.Şaiq. *Qaragöz tez küncə qaçıb, ucları alaçığın iki tərəfində bərkidilib asılmış balaca nənnini yellətdi.* M.İbrahimov. // Bir şeyin qurtaracaq hissəsi, kənarı, bir başı. *Bağın bu biri ucunda. Dünyanın o ucunda. Şəhərin o biri ucunda. – Qurban Şeytanbazarın ucunda məktub yazan həmşəhərlisi Molla Fərzəlinin yanında oturmuş*(*du*). A.Şaiq. // Uzun şeyin hər iki qurtaracaq tərəfindən biri; baş. [Camal bəy:] *Xanımlar əllərində uzun ağac ucunda ağ dəsmal duracaqlar qəlbidə.* N.Vəzirov. [Bəyim] *bağırsaq kimi çözələnən rezin borunun bir ucunu su kranına taxıb asfaltı yuyurdu.* İ.Hüseynov. // Bir şeyin kənarını təşkil edən kiçicik hissəsi. *Burnun ucu. Barmaqların ucu. – Usta Ağabalanın saqqalı gicgahlarına getdikcə ucları nazilib, gözəl surətdə qulaqlarına yapışırdı.* Çəmənzəminli. [Quşun] *yaralı qanadının ucu sallanmışdı.* M.Rzaquluzadə. // Axır, son, intəha. *Cənnət qoxan qırlar, əngin obalar; Bir atlasdır yaşıl, ucu görünməz.* A.Şaiq. [Vəli:] *Milin düzündə qoyun korluq çəkər? Allah abad eləsin, ucu yox, bucağı yox.* N.Vəzirov.

2. Baş, təpə. *Evinizin dalı iydə; İydənin ucları göydə.* "Əsli və Kərəm". *Günəş yaxın dağlar ucundan doğar; Buludları gözəl rənglərlə boyar.* A.Şaiq.

3. **Ucundan** şəklində – ...səbəbindən, ...üzündən, ...ucbatından, ...görə. [Xədicə:] *Biçarə Yusif mənim ucumdan nələr çəkibdir.* N.Nərimanov. *Sizin ucunuzdan üzümə söz gəlir, siz isə məni ələ salırsınız.* Ə.Vəliyev.

◊ **Ucu açılmaq** – izdihamla gəlməyə, yeriməyə, irəliləməyə başlamaq. *Gözlə ha gözlə, gözlə ha gözlə, axırda dəstənin ucu açıldı.* "Koroğlu". **Ucundan tut, göyə çıx** – çox güclü yağış haqqında. *Gur-gur guruldadı göy, tökdü yağış; Ucundan tut, göyə çıx!* R.Rza. **Ucundan tutub ucuzluğa getmək** – danışığında hədd-hüdud bilməmək, artıq-əskik danışmaq, sözünün dalını-qabağını bilməmək. [Surxay:] *Mehralı dayı, ucundan tutub ucuzluğa getmə.* S.Rəhman. **Ucunu qaçırmaq** – hesabı çaşdırmaq, dolaşıq salmaq. **Ucunu tapmaq** – həllini tapmaq, həllinə yol tapmaq. ...**ucu ilə** – ...nəzərə alaraq, ...müvafiq olaraq, ...görə. *Əfqanıstan iğtişaş və üsyanından biz hərçənd ki uzağıq, amma zehin ucu ilə deyə bilərik ki, burada ingilis barmağı var.* C.Məmmədquluzadə. **Ayağının ucunda** – yavaşca, üsulluca, ehmallı, səs çıxarmadan, yeridiyini hiss etdirmədən. *Süreyya yavaşca pəncərəni örtüb, ayağının ucunda ehmallıqla qayıdıb, yatacağına uzandı.* Çəmənzəminli. *Ana uşağı oyatmağa qıymayaraq ayağının ucunda evi dolaşdı, işlərini gördü.* Ə.Vəliyev. **Baş ucunda** – yanında. *Baş ucumda birdən-birə; Qüvvətli bir səs ucalır.* N.Rəfibəyli. **Bir ucdan** – bir tərəfdən, bir başdan, arasıkəsilmədən, dalbadal. *Zərgər... bir ucdan oğurlar, bir ucdan satar.* Q.Zakir. *Arvad kişini bir ucdan hey dürtmələyirdi.* S.Rəhimov. **Bir ucu** – bir tərəfi, bir tərəfdən. [Şahmar bəy:] *Dadaş, bu, yaxşı olmadı. Bu sözün bir ucu da sizə toxunur.* N.Vəzirov. **Burnunun ucunda** – lap yaxınında, lap yaxın, yanındaca. **Dilinin ucunda** – yadda olub deyiləcək anda yaddan çıxan şey haqqında. *Onun adı dilimin ucundadır. Dilimin ucunda idi, yadımdan çıxdı.* **Gözünün**

**ucu ilə baxmaq** – b a x **gözucu**. *Əlisəfa gözünün ucu ilə pula baxdı*. S.Hüseyn. *Mən bilirdim ki, artıq hər şey məhv olmuşdu, lakin yenə də gözümün ucu ilə də olsa, onu görmək istəyirdim.* Ə.Məmmədxanlı.

**UCA** *sif.* 1. Yüksək, hündür. *Uca boy. Uca bina. Uca ağac. – Buludlara dəyir uca dağları; Cənnət guşəsidir gözəl bağları.* A.Səhhət. *Xudayar bəyin ancaq otuz yeddi-otuz səkkiz sinni olar. Boyu ucadı, çox ucadı.* C.Məmmədquluzadə. // Ucaboylu, boylu-buxunlu. *Uca oğlan. Uca kişi. – Heç yadımdan çıxmır, konsul özü bir uca adamdır, amma mən alçaq adam.* C.Məmmədquluzadə. // Çox hündürdə, çox yüksəkdə yerləşmiş. *Uca yer. Uca ulduzlar. Dağlıq rayonun ən uca kəndi.* // *is*. Uca yer. *Çıxım gədiklərnən, izin izləyim; Ucalardan alçaqları gözləyim*. “Koroğlu”.

2. *məc*. Yüksək, ali, ülvi. *..Min cürə uca fikirlər və müqəddəs hisslər şairin silsileyitəbinə hərəkət versə, daha* [gözəl] *olmazdımı?* F.Köçərli. *Gözəldir bir uca əməl bəsləyib; Bu əməl uğrunda qan-tərə batmaq.* M.Müşfiq.

3. Yüksək, yuxarı, zil; ucadan, bərkdən. *Günorta idi. Müəzzin uca səslə azan verirdi.* Çəmənzəminli. [Böyükxanım] *axırda uca səslə ağlayaraq... durub genə əlini Rzaquluxanın çiyninə qoyub deyirdi*. M.S.Ordubadi. ◊ **Özünü uca tutmaq** – təkəbbür satmaq, başqalarına xor baxmaq, özünü hamıdan yüksək saymaq. [Sərdar Rəşid] *özünü çox uca tutur*. M.S.Ordubadi. **Uca tutmaq** – yüksək tutmaq, yüksəklərə qaldırmaq, şərəfləndirmək. [Hidayət Mürşidə:] *İnsanlıq ləyaqətini uca tutduğunuza görə sizə təşəkkür edirəm.* B.Bayramov.

**UCABOY(LU), UCAQAMƏT(Lİ)** *sif.* Boyu uca, boylu-buxunlu, qədd-qamətli. *Ucaboy oğlan. Ucaboy qadın*. – [Əmi] *ucaboy, gərdənli, qarasaqqal, xoşsima bir kişi idi*. N.Nərimanov. *Sona xala kişi təbiətli, ucaqamətli .. bir qadın idi*. S.S.Axundov.

**UCADAN** *zərf* 1. Bərkdən, yüksəkdən, zildən. *Ucadan danışmaq. Ucadan gülmək. Ucadan demək. Ucadan oxumaq.* – [Adamlar] *ucadan və həyəcanla danışır, nə barədə isə mübahisə edirdilər*. M.İbrahimov. [Dürrə adamların] *bu sözünü eşidib ucadan soruşdu.* S.Vəliyev.

2. *məc*. Yüksək mövqedən, yuxarı vəzifədən. *İndi dünyada qayda belədir ki, birisi ucadan alçağa yenə, dövlətlilikdən kasıblığa düşə, söhbəti həmişə aparıb çıxardacaq keçən günlərinə*. C.Məmmədquluzadə.

**UCALAN** *f.sif.* Uzaqdan görünən, qalxan, yüksələn (uca bina, ağac və s. haqqında). [Sarxan] *istər-istəməz gözlərini dərədə qara zolaqlar kimi ucalan tüstüyə dikdi.* M.Hüseyn. // Havaya qalxan, yüksələn, havalanan. *Ucalan təyyarə* (*balon*).

**UCALANDIRMA** “Ucalandırmaq”dan *f.is.*

**UCALANDIRMAQ** *f.* Ucaltmaq, yüksəltmək, uca etmək, qaldırmaq. ☐ **Adını ucalandırmaq** – adını yüksəltmək, şöhrətləndirmək. *Bu iş Əminin adını daha da ucalandırırdı*. N.Nərimanov.

**UCALANMA** “Ucalanmaq”dan *f.is.*

**UCALANMAQ** *f.* Ucalmaq, yüksəlmək, yüksəklərə qalxmaq, uca olmaq. *Dul övrət isə sailə olsun, oda yansın; Ancaq mənim avazeyi-şənim ucalansın.* M.Ə.Sabir.

**UCALAŞMA** “Ucalaşmaq”dan *f.is.*

**UCALAŞMAQ** *f.* Yüksəlmək, getdikcə qalxmaq, ucalmaq. *Səs ucalaşdı, qoymayın! Millət oyaşdı, qoymayın!* M.Ə.Sabir.

**UCALDILMA** “Ucaldılmaq”dan *f.is.*

**UCALDILMAQ** “Ucaltmaq”dan *məch*.

**UCALIQ** *is.* 1. Yüksəklik, hündürlük. *Dağın ucalığı. Boyun ucalığı. Tavanın ucalığı. – Siz öləsiz, elədi, bax, odu, Hacı Namazalı özüdü, papağının ucalığı burdan da görsənir.* C.Məmmədquluzadə. // Ətraf sahəyə nisbətən daha hündür olan sahə, yer; təpə. *Ölçüsüz ucalıqda; Qorxunc bir külək qopar; Kəsərdi yollarını qanadlarımın*. R.Rza.

2. *məc*. Yüksək ictimai mövqe, vəziyyət. *Əzalar isə süst olub indi qocalıqdan; Bir dadrəsim yox, görməzmisən əhvalımı, düşdüm ucalıqdan.* M.Ə.Sabir. [Səkinə:] *Yox, Rüstəm, sən heç şeyə aldanma, nə elə ucalığını istəyirəm ki, əl çatmasın, nə də elə yıxılmağını ki, ayaqlar altına düşəsən*. M.İbrahimov.

3. *məc*. Mənəvi yüksəklik, təmizlik, nəciblik, alicənablıq; şərəf. *İstəyim xalqıma hər an ucalıqdır, ucalıq; Mənə yaddır qocalıq.* S.Rüstəm. [Tahir] *yenə də bu xüsusda düşünür, Lətifənin mənəvi ucalığı ilə fəxr eləyirdi.* M.Hüseyn.

**UCALMA** "Ucalmaq"dan *f.is.*

**UCALMAQ** *f.* 1. Daha da yüksəlmək, qalxmaq, yuxarıya doğru artmaq. *Suyun səviyyəsi xeyli ucalmışdır. Binanın divarları gündən-günə ucalır*. // Uzaqdan görünmək (uca şeylər haqqında). *Artıq Şuşa şəhəri görünür, Xanqızının ağ imarəti ucalır.* S.Rəhimov. *Torpaq yoldan bir az kənarda, yastı yamacda bir fin evi, ağ çadır və buruq vışkası ucalırdı.* M.Süleymanov. // Boy atmaq, qalxmaq. [Cavan qızın] *boyu ucalıb, köksü dolğunub, simasında da ayrı məlahət görünürdü.* Çəmənzəminli. *Daşlıq yolun kənarlarında ot-ələf elə ucalmışdı ki, deyərdin, buralar xüsusi biçənək yeridir.* Mir Cəlal.

2. Qalxmaq, qopmaq, yüksəlmək, güclənmək, ucadan eşidilmək (səs haqqında). *Nagəhan küçədə ucaldı səda; Vurharay düşdü, qopdu bir qovğa.* M.Ə.Sabir. *Heyfa ki çıxmadı tarın sədası; Ucalmadı kamançanın nəvası*. A.Səhhət.

3. *məc.* Hörməti, nüfuzu artmaq, yüksəlmək, hörmətə minmək. *Camaat arasında ucalmaq. – Aşıq qocalar, gəzər; Eldə ucalar, gəzər; Sonsuz öləndən sonra; Ruhu bacalar gəzər.* (Bayatı). *Şəmşir kimi sən də doğru, düz dolan; Çox olub tarixdə enən, ucalan.* Aşıq Şəmşir. // Yüksəklərə qalxmaq, göyə qalxmaq. *..Qırmızı bayraqlar ucalmış göyə; Hazırlıq görürlər, qovğa var deyə.* A.Şaiq.

**UCALTMA** "Ucaltmaq"dan *f.is.*

**UCALTMAQ** *f.* 1. Yüksəltmək, daha uca etmək, qaldırmaq, getdikcə hündürlüyünü artırmaq (bina və s. haqqında). *Yeni binaları ucaltmazdan əvvəl köhnə evləri sökmək lazım idi.* H.Seyidbəyli.

2. *məc.* İctimai mövqeyini, əhəmiyyətini, nüfuzunu, hörmətini artırmaq, yüksəltmək. *Alicənab hərəkəti cəmiyyətin nəzərində onu xeyli ucaltmışdır. – Meydana buraxdığın böylə şah əsərlərlə; Ucaldırsan ölkəmin şöhrətini, şanını*. M.Müşfiq.

3. Gücləndirmək, yuxarı qaldırmaq, zilləşdirmək (səs haqqında). *Məmmədhəsən əmi oğluna yalvardıqca oğlan səsini ucaldırdı.* C.Məmmədquluzadə. *Salman kişi səsini getgedə ucaldırdı*. Mir Cəlal.

**UCAMƏRTƏBƏLİ** *sif.* 1. Uca, yüksək, hündür, çoxmərtəbəli. *Ucamərtəbəli ev* (*bina*).

2. *məc. köhn*. Yüksək vəzifə sahibi olan, yüksəkvəzifəli.

**UCBATINDAN** *zərf* ...səbəbindən, ...üzündən, ...təqsiri üzündən, ...səbəbilə. *Sənin ucbatından bizə də söz gəldi. – Ac da qalsanız, susuz da, bu, bizim ucbatımızdan deyil.* M.Hüseyn. [İlyas Adiləyə:] *Tərlan da dayımın atı idi, amma mənim ucbatımdan o möcüzə məhv oldu.* Ə.Məmmədxanlı.

**UC-BUCAQ** *is.* Kənar, son hədd, hədd-hüdud. *Bu bizimçün elə bir dünya idi ki, ucu-bucağı yox idi*. S.Rəhman. *Edqarın ixtiyarında olan üzüm bağının ucu-bucağı yox idi*. S.Vəliyev. ☐ **Ucu-bucağı görünməmək (olmamaq)** – sonu, ətrafı gözlə qavranıla bilməyən çox geniş sahə haqqında. *Ucu-bucağı görünməyən .. məhsuldar çöllər yorulmadan və inadla çalışan insanlarla doludur.* M.İbrahimov. *Yolumuz ucu-bucağı görünməyən yaşıl tarlalar, təzə salınmış meşə zolaqları arasından keçirdi*. M.Dilbazi. // Böyük izdiham, saysız-hesabsız insan kütləsi haqqında. [Atakişi:] *Adamın ucu-bucağı yox idi.* C.Cabbarlı.

◊ **Ucundan-bucağından** – oradan-buradan. *Mən kitabı tapdım, ucundan-bucağından oxudum.* M.S.Ordubadi.

**UC-BUCAQSIZ** *sif.* Ucu-bucağı olmayan, hədd-hüdudu olmayan; çox geniş, intəhasız. *İnandığım ərənlərin birini; Uc-bucaqsız bir səhrada tapmışam.* Ə.Cavad.

**UCDAN-QIRAQDAN, UCDAN-QULAQDAN** *zərf* Başqalardan, özgələrdən; bilavasitə deyil, bilvasitə. *Ucdan-qıraqdan qulağına dəyən sözlər Hürüyə mənasız görünürdü.* M.İbrahimov. [Rəşid:] *Mən nəfəs almadan, heç olmasa ucdan-qulaqdan bir şey eşitməyə çalışdım.* İ.Hüseynov.

**UCDANTUTMA** *zərf* və *sif.* Fərq qoymadan, ayırmadan, arada buraxmadan, hamını, başdan-başa, bilavasitə bir-birinin ardınca, bir-bir. *Ucdantutma siyahıya alma. Ucdantutma səfərbərlik. – Kim insanları ucdantutma pis hesab eləyirsə, onun öz ürəyi təmiz deyil*. M.Hüseyn. [Ataş:] *Gündə iki dəfə mənzili axtarılanda, ucdantutma çölə tökülüb işsiz qalanda fəhlə də qırmızı bayraq qaldırar.* Ə.Vəliyev.

**UCQAR** *is.* Bir yerin ən uzaq hissəsi, kənarı. *Nigar nə Koroğluya baxdı, nə dəlilərə baxdı, yavaş-yavaş təpənin lap ucqarlarına gəldi.* “Koroğlu”. *..Meşənin ucqarında dağkeçisi görünür.* S.Rəhimov. // Şəhərin, qəsəbənin mərkəzindən kənarda olan hissəsi, məhəlləsi. *Ucqarlara suçular su daşıyırdılar.* A.Şaiq. *Şəhərin ucqarı olan bu küçədə .. heç kəs gözə dəymirdi.* Ə.Məmmədxanlı. // Uzaq. *Mənə gəl-gəl deyir hər ev, hər ocaq; Yurdumun ən ucqar bucağındayam.* S.Rüstəm. *Divardan asılmış Azərbaycan xəritəsində ucqar dağlar qoynunu göstərdi.* M.Rzaquluzadə. // Ölkənin, dövlətin mərkəzdən uzaqda olan vilayəti, rayonu.

**UCLUQ** *is.* Bir şeyin ucuna keçirilən, taxılan, geydirilən adətən konusşəkilli qalpaqcıq. *Karandaş ucluğu. Mərmi ucluğu.*

**UCSUZ-BUCAQSIZ** b a x **uc-bucaqsız**. *Ucsuz-bucaqsız tarlalar. Ucsuz-bucaqsız ölkəmiz. – Qarşıda ucsuz-bucaqsız geniş bir çöl sərilmişdi.* H.Nəzərli. *Arxa tərəfdən ucsuz-bucaqsız geniş düzənlik uzanıb gedirdi.* İ.Əfəndiyev.

**UCUBİZ** *sif.* Ucu biz kimi olan, ucuşiş, ucu getdikcə nazikləşən. *Ucubiz burun.*

**UCUİTİ** *sif.* Ucu iti olan, ucuşiş. *Ucuiti dəmir. Ucuiti yaba.*

**UCUNDAN** b a x **ucbatından**. *Gecə-gündüz oda düşüb yanaram; Siyah telli bir sonanın ucundan.* M.V.Vidadi. *Bir-iki nəfərin ucundan iki ay təkrar təlimə saxlanan əsgərlər də, komandirlər də dərsi bilməyənlərə acıqlanmışdılar.* Mir Cəlal.

**UCUŞİŞ** b a x **ucubiz**.

**UCUZ** *sif.* 1. Az pula satılan, qiyməti aşağı olan, dəyəri baha olmayan (*baha* ziddi). *Ucuz palto. Ucuz parça. Ucuz enerji. – Ucuz ətin şorbası olmaz.* (Məsəl). *Söz yox, ulaq atdan yaxşıdır. Əvvələn, ondan ötrü, ulaq atdan ucuzdu.* C.Məmmədquluzadə. *Burada nisbətən ucuz qiymətə şərab da tapmaq olurdu.* Ə.Əbülhəsən. *İndi o qədər ov tüfəngi var ki, özü də qiymətdə ucuz.* M.Rzaquluzadə. // Zərf mənasında. [Cavad ağa:] *Taxılı ucuz buraxın, çox buraxın, çörək də ucuz olsun.* M.S.Ordubadi. *Malı ucuz alıb, baha satanlar; Dəllaldır, onları cilovlayaq biz.* B.Vahabzadə.

2. *məc.* Zəhmətsiz, əziyyətsiz, asanlıqla əldə edilən (başa gələn). *Ucuz şöhrət ardınca qaçmaq. Ucuz qazanc.* – [Leyla:] *De ki, üz döndərib məhəbbətimdən; Ucuz şöhrətlərə əyilmərəm mən!* B.Vahabzadə. // *məc.* Heç bir qiyməti, dəyəri olmayan; dəyərsiz, əhəmiyyətsiz, boş, bayağı. *Ucuz söhbətlər. – Nahaq söz od vurar qəlbə, fəqət haq söz keçər daşdan; Ucuz söz qan qaraldar ki, küsərsən dostla sirdaşdan.* S.Vurğun.

◊ **Ucuz başa gəlmək (oturmaq)** – zəhmətsiz, əziyyətsiz, asanlıqla başa gəlmək, əldə edilmək. *Lakin Əmir Həşəməti və onun təşkilatını dağıtmaq təşəbbüsü çar konsuluna ucuz oturmadı.* M.S.Ordubadi. **Ucuz qurtarmaq** – xoşagəlməz, yaxud xətərli bir işdən, hadisədən çox asanlıqla, başına bir iş gəlmədən qurtarmaq. **Ucuz olmaq** *məc.* – qiymətdən düşmək, yüngül olmaq, hörmətdən düşmək, heysiyyətini, mənliyini itirmək. *Təmkini cünunə qılma təbdil; Qızsan, ucuz olma, qədrini bil!* Füzuli. **Ucuz tutmaq** – əhəmiyyət verməmək, saymazlıq göstərmək, qiymətləndirməmək. *Onun sözlərini ucuz tutma. – Görəsən vicdanı salırmı yada; Eşqin mənasını ucuz tutanlar?!* S.Vurğun. [Şərəfoğlu:] *Haqq-sayı, yoldaşlığı, dostluğu da belə ucuz tutmaq olar?* M.İbrahimov.

**UCUZCA** *sif.* və *zərf* Çox ucuz. *Ucuzca mal. Ucuzca satmaq.* // Məc. mənada. [Şamama Cadu:] *Allahın bu ucuzca ölümü də gəlib məni tapmır.* Ə.Haqverdiyev.

**UCUZÇU** *sif.* Malını ucuz satan, yaxud ucuz mallar axtarıb satın alan adam.

**UCUZLANMA** “Ucuzlanmaq”dan *f.is.*

**UCUZLANMAQ** b a x **ucuzlaşmaq**.

**UCUZLAŞDIRILMA** “Ucuzlaşdırılmaq”-dan *f.is. Qiymətlərin ucuzlaşdırılması.*

**UCUZLAŞDIRILMAQ** *məch.* 1. Ucuz edilmək, qiyməti aşağı salınmaq.

2. *məc.* Qiymətsizləşdirilmək, qiymətdən salınmaq, hörmətdən salınmaq.

**UCUZLAŞDIRILMIŞ** *f.sif.* Qiyməti aşağı salınmış, daha ucuz edilmiş. *Ucuzlaşdırılmış mallar. Ucuzlaşdırılmış qiymət. Ucuzlaşdırılmış paltar mağazası.*

**UCUZLAŞDIRMA** “Ucuzlaşdırmaq”dan *f.is.*

**UCUZLAŞDIRMAQ** *f.* 1. Qiymətini aşağı salmaq, daha ucuz etmək. *Sənaye mallarının qiymətini ucuzlaşdırmaq. – Axır zamanlarda tikintinin hər yerində qənaət, maya qiymətini ucuzlaşdırmaq, israfa yol verməmək haqqında danışırdılar*. Ə.Sadıq.

2. *məc.* Qiymətdən salmaq, qiymətsizləşdirmək, hörmətdən salmaq, etibardan salmaq, ayağa salmaq. *Sözləri ucuzlaşdırmaq.*

**UCUZLAŞMA** "Ucuzlaşmaq"dan *f.is.*

**UCUZLAŞMAQ** *f.* Daha ucuz olmaq, qiyməti enmək. *Bazarda meyvə çox ucuzlaşmışdır*. – [Xalası Adilə:] *Xala qurban, deyəsən, bazarda çörək ucuzlaşıb?* B.Bayramov. // *məc.* Qiymətdən düşmək, əhəmiyyətini itirmək; hörmətdən düşmək.

**UCUZLU** *sif.* Ucuz, daha ucuz. [Anam:] *Təzə nəlbəkini qonaq qabağına qoyaram, ucuzlusunda özüm çay içərəm*. Mir Cəlal.

**UCUZLUQ** *is.* Qiymətlərin ucuz olduğu vəziyyət (*bahalıq* ziddi). *Ucuzluqda alıcının, bahalıqda satıcının üzünü görmə*. (Ata. sözü). *Mirzənin zamanında bazarda ucuzluq idi*. Ə.Haqverdiyev.

**UCUZVARİ** *sif.* Bir qədər ucuz. *Ucuzvari palto. Ucuzvari şey.*

**UÇAĞAN[1], UÇAĞANOTU** *is. bot.* Söyüdçiçəklilər fəsiləsindən çoxillik ot bitkisi. *Uçağanotunun toxumları xırdadır. Toxumlarının aşağısında uçağan rolunu oynayan bir dəstə tükcük vardır*. H.Qədirov. *Al laləyə qara qurşaq! Uçağana tükdən papaq; Verdi yazda ana torpaq*. M.Dilbazi.

**UÇAĞAN[2]** b a x **parabüzən**.

**UÇAĞAN[3]** *sif.* İti uçan, qaçağan. *Uçağan at.*

**UÇAR** *sif.* 1. Uçan, təbəxxür edən, başqa hala keçib havaya qarışan. *Uçar mayelər. Uçar qaz.*

2. Uçan, havada, göylərdə seyr edən. *Uçar quşlar. – Uçarda turacdır, qaçarda ceyran*. S.Vurğun.

**UÇQUN** *is.* Dağlardan, qayalardan, ümumiyyətlə, hündür yerlərdən qopub düşən qar, daş, qaya, torpaq koması. *Birdən ordan qar uçqunu uçdu; Bərk səsilə guruldayıb düşdü*. A.Səhhət. *Dörd il əvvəl bu ailənin Hənifə adlı böyük qızı gilabı qazdığı yerdə uçqun altında qalıb həlak olmuşdu.* Ə.Əbülhəsən.

**UÇQUNYANAQLI** *sif.* Yanaqları batmış, ordları batmış, ordubatıq. *Bu, on beş-on altı yaşlarında, ortaboylu, qaragözlü, uçqunyanaqlı, sarımtraq .. bir qızcığazdı.* C.Cabbarlı.

**UÇMA[1]** "Uçmaq[1]"dan *f.is.*

**UÇMA[2]** "Uçmaq[2]"dan *f.is. Qatırçılar bu yollarda araba aşmasından, adam uçmasından faciəli hadisələr danışırdılar*. Mir Cəlal.

**UÇMAQ[1]** *f.* 1. Qanadlar vasitəsilə havada hərəkət etmək, havaya qalxıb getmək, havada gəzmək. *Havada quşlar uçur. – Hələ tamam qurumamış yağış gölləri; Üzərində bulud-bulud uçur milçəklər*. S.Vurğun. *Dağın baş tərəfinə yaxın bir yerdə qartallar uçurdu.* Mir Cəlal. // Uçub gəlmək, uçub qonmaq, uçub getmək. *Mən bir bəlalı quşdum; Dağdan qayaya uçdum.* (Bayatı). *Pendir ağzında bir qara qarğa; Uçaraq qondu bir uca budağa*. M.Ə.Sabir. // Uçucu maşınlar – təyyarə, dirijabl və s. haqqında. *Uçur dağıdaraq buludu lay-lay; Təyyarə göylərin yeddi qatında.* B.Vahabzadə. // Təyyarə ilə getmək. *Bu gün Türkiyəyə uçuram. Saat neçədə uçursan? Sizinlə daha kimlər uçur? – Hətta bir dəfə mən özüm də aeroplanda uçmuşam*. H.Nəzərli. *İndi Əşrəf də ulduznişan bir təyyarədə uçur*(*du*). Mir Cəlal. // Havada qanad çalmaq, pər vurmaq. *Quşlar uçdu havada; Balası var yuvada.* (Bayatı). // Havada seyr etmək, dolaşmaq, hərəkət etmək. *Uçur buludlar üfüqlərdə, toplanır əlvan; Alırdı başqa lətafət dərə, təpə, orman.* A.Şaiq. *Uzaq üfüqdə dağlar qaralır, göydə tez-tez ulduz uçurdu.* İ.Əfəndiyev. // Külək, təkan və s. gücü ilə havada hərəkət etmək, getmək. *Güllələr başımızın üstündən uçurdu. Qığılcımlar parıldaya-parıldaya uçur.*

2. Qaz, ya buxar halına keçib havada yox olmaq, qarışmaq, təbəxxür etmək (bu mənada çox vaxt "uçub getmək" şəklində işlənir). *Dərmanın spirti uçub. – Buzu qoydum yerə, gördüm ki, od kimi isti torpağa buz cızıltı ilə yapışıb, az qaldı havaya uçsun*. C.Məmmədquluzadə.

3. *məc*. Çox sürətlə getmək, keçmək, ötmək, ötüb getmək. *Vaxt nə tez uçdu? – Zamanın budağından; Qoparaq xəyal kimi; Yenə uçurdu günlər.* R.Rza. // *məc*. Çox sürətlə yerimək, getmək, çaparaq getmək (bu mənada bəzən "qanadlanıb", "yel kimi", "quş

kimi" və s. sözlərlə birlikdə işlənir). *Qırat yeldən qanad taxıb uçurdu.* "Koroğlu". *Atlar buğlana-buğlana uçur, vağzala yaxınlaşırdı.* M.Hüseyn.

4. *məc.* Çıxmaq, qopmaq. [Səlim:] *Ah! Bu yalan bir söz, zəhərli bir ox; Ağzında uçub qəlbimə saplanır.* H.Cavid.

5. *məc.* Solmaq, rəngi qaçmaq, rəngi çəkilmək, silinib getmək. *Astanada tüstülənir böyrübatıq samovar; Ləmədəsə rəngi uçmuş beş-on nimçə, kasa var.* S.Rüstəm.

6. *məc.* Hara isə getmək, haralarda isə dolaşmaq (fikri, xəyalı və s.). *Könlüm uçur dağa-daşa; Seyr etdikcə təbiəti.* M.Müşfiq. *Sahili döydükcə bəzən ləpələr; Şairin xəyalı uçub yüksəlir.* S.Vurğun.

◊ **Buğlanıb (buğ olub) havaya uçmaq** – yox olmaq, yoxa çıxmaq, hədər getmək, nail olmaq. *..Gərək başlarımızın çanaqlarını da bərkitmək fikrində olaq ki, təhsil elədiyimiz elmlər buğlanıb havaya uçmasınlar.* C.Məmmədquluzadə. **Göyə uçmaq** – b a x **qanadlanıb uçmaq**. *Fərhad yalandan özünü təriflədikcə Aslan şadlığından, fərəhindən az qalırdı göyə uçsun.* C.Cabbarlı. **Qanadlanıb uçmaq** – son dərəcə sevinmək, ruhlanmaq, sevincindən yerə-göyə sığmamaq. *Qadın az qaldı qanadlanıb uçsun.* Mir Cəlal. [Zərqələm] *beş qranı alınca sevinər, bir quş kimi qanadlanıb evlərinə uçardı.* Ə.Sadıq.

**UÇMAQ²** *f.* 1. Hər hansı bir səbəb üzündən yıxılmaq, dağılmaq; öz ağırlığının təsiri altında düşmək; yıxılmaq, uçulmaq. *Dam uçdu. Qaya uçanda toz qopar. – Qışda uçmuş* (f.sif.) *damlar qayrılır, rəxnələnmiş hasarlar təmir olunub düzəlirdi.* S.Hüseyn. // *məc.* Dağılmaq, yıxılmaq, yox olmaq, məhv olmaq, alt-üst olmaq, yerlə yeksan olmaq. *Uçdu xalqlar məhbəsi; Ellər bərabər oldu.* R.Rza.

2. Uca bir yerdən yıxılmaq, düşmək, üzüaşağı aşmaq, yuvarlanmaq. [Qurban:] *Pənah Allaha, haraya çıxım, qoy dağdan, qayadan uçum, yırtıcı heyvanat məni dağıtsın.* Ə.Haqverdiyev. *Elə uçurum, sıldırım qayalıq yerlərdən keçirdim ki, ayağımın altından bir daş uçsa idi, birbaş dərəyə yuvarlanıb parça-parça olacaqdım.* A.Şaiq.

**UÇOT** [*rus.*] Hesabaalma, siyahıyaalma, hesablayaraq qeydəalma. *Malların uçotu. Yeni uçot formaları. Mal-qaranın uçota alınması.*

**UÇOTÇU** *is.* Uçot işləri aparan şəxs.

**UÇUCU** *sif.* 1. Uçan, havada uça bilən, havada uçmaq üçün düzəldilmiş, ya uyğunlaşdırılmış. *Uçucu aparatlar* (*təyyarə, dirijabl, vertolyot və s.*).

2. *xüs.* Tez buxarlanan, buxarlanıb havaya qarışan, buxar, ya qaz halına keçə bilən. *Uçucu maddələr. Uçucu efir yağları. Spirt nə qədər qatı olarsa, o qədər də uçucudur.*

**UÇUCULUQ** *is.* 1. Uçucu aparatlarda havada uçma sənəti, bacarığı, işi. *Pilotun uçuculuq məharəti. Təyyarənin uçuculuq qabiliyyəti.*

2. Maddələrin tez buxarlanıb havaya qarışması xassəsi. *Mayenin uçuculuğu.*

**UÇUQ¹** 1. *sif.* Uçulmuş halda olan, yıxıq. *Uçuq dam. Uçuq pəncərə. – Hamamın alçaq və uçuq divarları böyük günbəzlərə söykənərək yüz illərdən bəri bu hal ilə dayanırdı.* Çəmənzəminli. *Yolçu .. qarşısına çıxan ilk uçuq daxmalardan birisinə girdi.* Ə.Məmmədxanlı.

2. *is.* Uçulmuş binanın və s.-nin qalıqları, uçulmuş yer; xarabalıq. *Adamlar dəstə-dəstə olub əllərində kürək, bel, külüng uçuqları* [zəlzələdən uçmuş evləri] *qazmağa başladılar.* S.S.Axundov. *Bu arada olan ev nişangahları və bu uçuqlar içindən qalxan palıd ağacları çox uzaqları xatırladırdı.* S.Rəhimov.

**UÇUQ²** *is.* Qızdırmadan və ya başqa səbəbdən dodaqda çıxan qabarcıq(lar). *Dodağına uçuq çıxmaq.*

**UÇUQLAMA** "Uçuqlamaq"dan *f.is.*

**UÇUQLAMAQ** *f.* Qızdırmadan və ya başqa səbəbdən uçuq çıxmaq, uçuq(lar) əmələ gəlmək. *Dodaqları uçuqlamaq.*

**UÇUQ-SÖKÜK** b a x **uçuq**¹. [Almaz Camala:] *Burada nə var? Uçuq-sökük daxmalar, pəncərəsiz, işıqsız komalar.* C.Cabbarlı. *Onsuz da bu evin hər tərəfində keçmiş vuruşmaların şahidi olan bir çox uçuq-söküklər var idi.* H.Nəzərli.

**UÇULMA** "Uçulmaq"dan *f.is.*

**UÇULMAQ** b a x **uçmaq**². [Türbət:] *Ay haray, köməyə gəlin, taxtabənd uçuldu, adamlar qaldı altında.* C.Cabbarlı. [Calalın atası] .. *tövlə uçularkən bərk yaralanıb ölmüşdü.* S.Vəliyev.

**UÇUNCAQ** *is.* Yellənmək üçün düzəldilən qurğu; yelləncək. *Oğlan-qızla dolu uçuncaqlar, yelləncəklər havada firlanırdı.* S.Rəhimov.

**UÇUNMA** 1. "Uçunmaq"dan *f.is.*

2. *is.* Titrəmə, əsmə; titrəyiş. [Dərviş:] *Canımda bir uçunma peyda oldu..* A.Divanbəyoğlu. *Göyərçini titrətmə və uçunma götürdü.* S.Rəhimov.

**UÇUNMAQ** *f.* Titrəmək, əsmək, çırpınmaq. *Bədənim uçunur. – Bəy qəzəbindən qızdırmalı adamlar kimi uçundu.* M.Hüseyn. [Xanın] *saçı-saqqalı qar kimi ağarmış, çuxura düşmüş gözlərinin dövrəsi qaralmış, əli-ayağı əsir, bütün vücudu uçunurdu.* M.Rzaquluzadə.

**UÇUNTU** *is.* Uçulub tökülmüş şeylər; töküntü.

**UÇURDULMA[1]** "Uçurdulmaq[1]"dan *f.is.*

**UÇURDULMA[2]** "Uçurdulmaq[2]"dan *f.is.*

**UÇURDULMAQ[1]** "Uçurtmaq[1]"dan *məch.* *Göyərçin uçurduldu.*

**UÇURDULMAQ[2]** "Uçurtmaq[2]"dan *məch.* *Köhnə evlər uçurduldu.*

**UÇURMA[1]** "Uçurmaq[1]"dan *f.is.*

**UÇURMA[2]** "Uçurmaq[2]"dan *f.is.*

**UÇURMAQ[1]** b a x **uçurtmaq**[1]. *Quşları uçurmaq. Planer uçurmaq. Badban uçurmaq. – Budur, xəyal məni yerdən uçurur; O mənə göylərdə aşiyan qurur.* S.Vurğun.

**UÇURMAQ[2]** b a x **uçurtmaq**[2]. [İncə:] *..Fəqət atam, bilmirəm kimdən eşitmiş, istəyirdi bütün evi uçursun.* C.Cabbarlı. *Çay səllimi at kimi baş alıb gedir, bəndləri və sədləri uçururdu.* Ə.Vəliyev.

**UÇURTMA[1]** "Uçurtmaq[1]"dan *f.is.*

**UÇURTMA[2]** "Uçurtmaq[2]"dan *f.is.*

**UÇURTMA[3]** *is.* Badban, çərpələng. *Avropa üsulu ilə tərbiyə verən atalar uşaqlarını çox sevərlər, oxşarlar, onlara uçurtma verərlər.* "Məktəb".

**UÇURTMAQ[1]** *f.* Uçmağa sövq və ya məcbur etmək, uçmasına kömək etmək, uçmağa buraxmaq. *Quşu uçurtmaq. – Soldurma gəl gülümü; Uçurtma bülbülümü; Bir xəlvət yerdə otur; Deyim dərdi-dilimi.* (Bayatı).

**UÇURTMAQ[2]** *f.* 1. Tikili, qurulu bir şeyi dağıtmaq, yıxmaq, uçqun hala gətirmək, xarabaya döndərmək. *Köhnə binanı uçurtmaq. – Hitler Polşanı ayaqlarkən dahi şair Adam Mitskeviçin heykəlini uçurtdu.* M.Hüseyn.

2. *məc.* Devirmək, yıxmaq sındırmaq, son qoymaq, yoxa çıxarmaq. *Zaman bir gün uçurtdu şöhrət taxtından məni; Dar günümdə görmədim yanımda bir an səni.* S.Rüstəm.

**UÇURULMA[1]** "Uçurulmaq[1]"dan *f.is.*

**UÇURULMA[2]** "Uçurulmaq[2]"dan *f.is.*

**UÇURULMAQ[1]** "Uçurmaq[1]"dan *məch.* *Quşlar yuvalarından uçuruldu. – Yoxsa bunlar da qızıl quşlarmı? Göyə yerdən uçurulmuşlarmı?* M.Müşfiq.

**UÇURULMAQ[2]** "Uçurmaq[2]"dan *məch.* *Ümumi iclasdan on gün sonra, isti may günlərinin birində çaylağın o tərəf-bu tərəfindəki yarğanlar uçurulmağa başladı.* Ə.Vəliyev. *Dünən bu yerdəki böyük bir bina; Bu gün uçurulub olmuş virana.* M.Rahim.

**UÇURUM** *is.* 1. Çox sarp, dik və dərin yamac; yarğan, sıldırım. *Sağımız dağ, solumuz qorxunc uçurum, meşəlik, dağlıqdır.* S.Rüstəm. *Uçurumun dibi böyük tikan kolları ilə örtülmüşdü.* Ə.Məmmədxanlı. // *sif.* Uçurumlu, sıldırımlı, sıldırım. *..Qaraca qızın qabağına bir uçurum dərə çıxdı.* S.S.Axundov. *Kəşfiyyatçılar iri gövdəli qalın meşədən birdən uçurum bir dərəyə düşdülər.* S.Rəhimov.

2. *məc.* Dərin fərq, ayrılıq, ziddiyyət. [Rəşid Naşad] *ər ilə arvad arasındakı uçurumu dərinləşdirirdi.* S.Hüseyn.

3. *məc.* Təhlükə, dəhşət, faciə, fəlakət; fəlakətli aqibət. *Qudurğan qasırğa, çarpaşıq yollar; Yolumda zülmət var, uçurumlar var.* Ə.Cavad. *Qarafikirli adamlar Təbriz xalqını .. uçurumlara çəkirdi.* M.S.Ordubadi.

**UÇURUMLU** *sif.* Uçurumları və yarğanları çox olan; sıldırımlı, yarğanlı. *Bu yer qalın, sıx meşəlik, çılpaq qayalıq, uçurumlu dərələrlə qucaqlanmışdı.* A.Şaiq. *Kür sahili uçurumlu və qorxuludur.* M.Hüseyn.

**UÇUŞ** *is.* 1. Uçma işi, uçan bir şeyin havada hərəkət etməsi. *Mərminin uçuşu. Arıların uçuşu. – Toyuğun uçuşu zibilliyə qədər olar.* (Ata. sözü). *Tamaşaçılar heyran-heyran bunlara baxır və böyük maraqla modellərin uçuşunu gözləyirdilər.* M.Rzaquluzadə. // Uçma tərzi, qaydası, üsulu. *Tərlan uçuşundan tanınar.* // Çox sürətli yeriş. *Tərlana bənzər uçuşun; Əl çatmaz ipək alına!* "Koroğlu". // Müəyyən vaxtı nəzərdə tutan təyyarə reysi. *Gecə uçuşları. Təyyarələrin uçuş cədvəli.*

2. *məc. tənt*. Vüsət, yüksəliş, coşqunluq. *Şeir, sənət daima mübarizə, uçuş, yüksəliş tərəfdarıdır*. S.Rəhimov.

**UÇUŞMA** "Uçuşmaq"dan *f.is. Yaşıl yarpaqların uçuşmaları, quşların nəğmələri qaranlıq dərəni oyadırdı*. S.Rəhimov.

**UÇUŞMAQ** *qarş*. 1. Birlikdə, bir-birlərinə qarışaraq uçmaq. *Uçuşurdu yanaşı; Göyərçinlə qızılquş!* Ə.Cavad. *Hinin üstündəki göyərçinlər, çardaqdakılardan da bir neçəsi həmin saat uçuşub həyətə qondular*. M.Rzaquluzadə.

2. *məc*. Saçmaq, çıxmaq. [Kərim baba] *..Qalın iri dodaqlarında daşqın sevinc qığılcımları uçuşaraq: – Qızılquş, balasını bu səslə çağırır, – dedi.* A.Şaiq.

3. Yelləncəkdə yellənmək.

**UD¹** *is*. [*ər*.] Vətəni Hindistan sayılan, yandırılanda xoş iy verən bir ağac (xoş qoxu vermək üçün otaqlarda xüsusi qablarda – buxurdanlarda yandırılardı).

**UD²** *is*. [*ər*.] Yaxın Şərqdə simli musiqi alətinin adı. *Oxuyub-çalanlar yavaş-yavaş kamança və udu hazırlayıb çalmağa başladılar.* M.S.Ordubadi. *Ud, ney, tar, kaman çaldırdıq; Qışqırıb həşir qopartdıq bu gecə!* Ə.Nəzmi.

**UDDURMA** "Uddurmaq"dan *f.is.*

**UDDURMAQ** *icb*. 1. Udmağa məcbur etmək.

2. *məc*. Qəbul etdirmək, qəbul etməyə məcbur etmək.

◊ **Qan uddurmaq** – b a x **qan**.

**UDÉL** [*rus*.] *tar*. 1. Qədim Rusiyada: knyaz və onun ailəsinin ayrı-ayrı üzvlərinə məxsus olan yerlər, torpaqlar, mülklər. *Hər bir böyük knyazlıq udellərə, yəni ayrı-ayrı knyaz ailəsinin üzvlərinə məxsus olan kiçik mülklərə ayrılırdı.* "SSRİ tarixi".

2. İnqilabdan əvvəlki Rusiyada: imperator malikanələri, padşaha məxsus mülklər.

**UDİN(LƏR)** Azərbaycanın şimalında yaşayan, iber-Qafqaz dillərinin birində danışan xalq.

**UDİNCƏ** *sif*. və *zərf* Udin dilində. *Udincə-azərbaycanca lüğət. Udincə danışmaq.*

**UDQUNMA** "Udqunmaq"dan *f.is.*

**UDQUNMAQ** *f*. 1. Reflektiv (qeyri-ixtiyari) olaraq boğazında, burnunda əmələ gələn seliyi udmaq, boğazı sanki bir şeyi udur kimi hərəkət etmək.

2. Sözünü deyə bilməmək, deməyə söz tapmamaq, sözü boğazında qalmaq, tutulmaq. [Zərifə] *tez udqundu, yaşarmış gözlərini əlindəki kiçik yaylığın ucu ilə sildi.* T.Ş.Simurq. *Kamal udqundu, duruxdu, tutuldu, düşündü.* C.Cabbarlı. *Bəhram udqundu, bir neçə saniyə cavab vermədi*. Ə.Vəliyev.

**UDLAQ** *is. anat*. Həzm cihazının bir hissəsi – ağız boşluğunu qida borusu ilə birləşdirən əzələ borusu. *Çeynənmiş və ağız suyu ilə islanmış qida udlaq və qida borusu ilə asanlıqla mədəyə ötürülür.* "Zoologiya". *Tənəffüs zamanı hava burun boşluğundan keçərək orada tozlardan təmizlənir, isinir və nəmlənərək udlağa keçir.* "Qaramal".

◊ **Udlağına dirənmək** – b a x **boğazından yapışmaq** ("**boğaz¹**"da).

**UDMA¹** "Udmaq¹"dan *f.is. Udma prosesi. Udma zamanı boğazda ağrı hiss etmək.*

**UDMA²** "Udmaq²"dan *f.is.*

**UDMAQ¹** *f*. 1. Udlaq əzələlərinin hərəkəti ilə bir şeyi ağız boşluğundan qida borusuna və mədəyə ötürmək. *Həbi udmaq. Bütöv tikəni udmaq. – Dəryalar tutdu məni; Naqqalar uddu məni; Əziz, istəkli dostum; Nə tez unutdu məni?* (Bayatı). *Qoca hülqumunda düyünlənən iri bir tikəni udan kimi oldu*. M.Hüseyn. // *məc*. Öz içinə alıb yox eləmək, məhv eləmək, həmişəlik aparmaq. *Arvad yerində qımıldandı: – Necə Ayaz gəlmədi?! Vay, kül mənim başıma, olmaya bu cəhənnəm uşağı da uddu!..* M.İbrahimov. *Ona çox görmə sən, gəl bu anları; Vuruş bəzən udur qəhrəmanları.* M.Rahim. // *məc*. Ümumiyyətlə, məhv etmək, yox etmək, puç etmək. [Nigar xanım dedi:] *Üç igidi udan dağlar; Dağlar, Eyvazı neynədiz?!* "Koroğlu". [Vaqif qapıçıya:] *Bu torpaq* [Qacarı] *da udar*. S.Vurğun. // *məc*. Çökmək, qaplamaq, qavramaq, içinə alaraq görünməz etmək. *Çayın dilə gəlmiş suyu sürətlə ətrafa yayılır, o taydakı çəltik və pambıq əkinlərini yalayıb udurdu.* Ə.Vəliyev. *Ağır buludlar get-gedə yerə enir, elə bil hər şeyi udmaq istəyir*. H.Seyidbəyli.

2. *məc*. Qanunsuz olaraq yiyələnmək, mənimsəmək, yemək, zora salıb almaq. *Baş-*

*qasının malını udmaq. – Rüşvət haramdır, – dedin, aldın, utanmadın! Mali-yetimə "od" deyə uddun da, yanmadın!* M.Ə.Sabir.

3. *məc.* Dözmək, təhəmmül etmək, qatlaşmaq, dözərək sükut etmək, üzə verməmək. [Səkinə] *dırnağına .. batan iynənin ağrısını udub, uf da demədən yenə öz işi ilə məşğul idi.* M.İbrahimov. // *məc.* Xoşagəlməz, təhqirli bir sözə, hərəkətə sakitcə, etirazsızca dözmək, ötürmək, cavabsız qoymaq, fikir verməmək. *Belə sözləri daha ud, bəy! – deyə, Alagöz qışqırıb qaçmaq istərkən Müqim bəy qapının ağzını kəsdi.* S.Rəhimov. [Zəhra] *Həsənin ona əl qaldırmasını və təhqiranə sözlərini heç cürə uda bilmirdi.* M.İbrahimov. [Yunis xalasına:] *Əgər sən bilsəydin ki, mən nəyi udub danışmıram..* Ə.Məmmədxanlı.

4. *məc.* Aydın, bütöv deməmək, yarımçıq demək, yaxud heç deməmək. *Sözü udmaq. Həyəcandan cümlənin axırını udmaq. – Xəlilov dilinin ucuna gələn sözünü güclə uddu.* M.Hüseyn.

◊ **Acı həb kimi udmaq** – b a x **udmaq**[1] 3-cü mənada. *Qurban sakitcəsinə bu zarafatlara və kəskin sözlərə dözür və hamısını acı həb kimi udurdu.* T.Ş.Simurq. **Qan udmaq** – b a x **qan**. **Hava udmaq** – təmiz havada dərindən nəfəs alaraq havanı içəri çəkmək, hava udmağa çıxmaq. *Dağlarda təmiz hava udmaq.* ...**havasını udmaq** *məc.* – ...havası ilə nəfəs almaq. **Zəhər kimi udmaq** – b a x **acı həb kimi udmaq**. *Hər kəs peşmançılığını bir zəhər kimi udmaq istəyirdisə də, bacarmır.* B.Bayramov.

**UDMAQ**[2] *f.* 1. Oyunda, yarışda üstün gəlmək, aparmaq. *Nərddə udmaq. Komanda 3:1 hesabı ilə rəqibini uddu.* – [Rəsul] *gördü ki, bu zalımlar udduqları pullarla kifayətlənməyib, üstəlik yatdıqları yorğan-döşək və balışları da aparmışlar.* "Aşıq Qərib". [Mərcan bəy:] *Mən qumar oynamamışam ki, udam ya uduzam...* Ü.Hacıbəyov.

2. Lotereya, loto, istiqraz oynanışında uduş əldə etmək, bəxtinə çıxmaq. *Üçfaizli istiqraz bileti üzrə yüz manat udmaq. Pul-şey lotereyasında xalça udmaq. – İkinci tirajda da Ağaverdi bir şey uda bilmir.* S.Hüseyn.

3. *məc.* Bir şeydə üstünlük qazanmaq, fayda, xeyir götürmək, xeyrinə həll olmaq. *Hər halda bu məsələdə o uddu. Mübahisəni kim uddu? – Siyasət hər zaman bir oyuncaqdır; Kim usta tərpənsə, o udacaqdır.* S.Vurğun.

**UDMURT(LAR)** Udmurt Respublikasının əsas əhalisini təşkil edən xalq.

**UDMURTCA** *sif.* və *zərf* Udmurt dilində. *Udmurtca qəzet. Udmurtca danışmaq.*

**UDUCU** *sif.* və *is. xüs.* Buğu, nəmi, rütubəti və s.-ni canına çəkən, udan. *Uducu cisimlər. Uducu maddələr. – Bu borular bir tərəfdən təmizləyici cihazlar, o biri tərəfdən isə uducularla rəbt olunur.* M.Mövsümzadə. *Kameraya karbon qazı uducuları, havavuran nasos, soyuducu və rütubətudan cihaz birləşdirirlər.* "Ümumi zootexniya".

**UDUXMAQ** *f.* Sözü demək istəmək, amma deyə bilməmək; boğazında qalmaq.

**UDULMA**[1] "Udulmaq[1]"dan *f.is.*

**UDULMA**[2] "Udulmaq[2]"dan *f.is. Udulmasından asılı olaraq həblər bir neçə vəzndə buraxılır.* R.Əliyev.

**UDULMAQ**[1] "Udmaq[1]"dan *məch.*

**UDULMAQ**[2] "Udmaq[2]"dan *məch. Lotereyada üç maşın udulmuşdur.*

**UDUM** *is.* Udarkən udlaq əzələlərinin birdəfəlik hərəkəti, udma hərəkəti. *Qarı əvvəlcə uşağa xeyli su içirtdi və tapşırdı ki, son udumunu udmayıb ağzında saxlasın, elə ki püflədi, o vədə udsun.* Ə.Vəliyev. □ **Bir udum** – bir dəfəyə udulacaq qədər, bir dəfə udmaq üçün kifayət edəcək qədər, bir qurtum. *Dərviş handan-hana özünə gəldi, bir udum çay aldı, boğazını yaşladı, yenə danışmağa başladı.* A.Divanbəyoğlu. *Qəhrəman stol üstündə buğlanan çay stəkanını əlinə alıb bir udum içdi.* Ə.Vəliyev.

◊ **Bir udumda** – dərhal, bir anda, o saat. *Bir udumda konyak yoxa çıxdı.* B.Bayramov.

**Udum-udum** *zərf* Udumlarla, qurtum-qurtum, az-az. *Tofiq isti çaydan udum-udum için-için təəccüblə boylanıb bayıra baxdı.* M.Rzaquluzadə.

**UDUŞ** *is.* İstiqrazda, lotereyada və s.-də udulmuş pul, şey. *Uduşların ödənilməsi. Uduş cədvəli.* – [Ağaverdi] *böyük uduşlar barəsində düşünmürmüş.* S.Hüseyn.

**UDUŞLU** *sif.* Uduşa hüquq verən, udan, uduş düşən. *Uduşlu əmanət. Uduşlu bilet.*

**UDUŞSUZ** *sif.* Uduş düşməyən, udmayan. *Uduşsuz lotereya bileti.*

**UDUZMA** "Uduzmaq"dan *f.is.*

**UDUZMAQ** *f.* 1. Oyunda, yarışda, döyüşdə, mübahisədə və s.-də məğlub olmaq, basılmaq, yenilmək. *Şahmatda uduzmaq. Yarışda uduzmaq. Müharibədə uduzmaq.* – [Dəstə] *kəşfiyyatdan əliboş qayıdarsa, vuruşmanı düşmən mütləq uduzacaqdır.* M.Hüseyn.

2. Qumarda pul və ya şeyini baxtalamaq, itirmək, əlindən çıxarmaq. [Həpo:] *Bu gecə on beş tümənin hamısını bir yerdə uduzdum.* M.F.Axundzadə. [Qayınatası Süreyyaya:] *Daha nə vaxtacan* [Səməd] *mənim malımı, pulumu aparıb uduzacaq?* Çəmənzəminli.

3. *məc.* Üstünlüyünü, yaxşı, əlverişli imkanını, xeyrini, yaxud fürsəti əlindən qaçırmaq, itirmək, malik olduğu və ya ola biləcəyi şeydən məhrum olmaq. *Amma* [Koroğlu] *tələssin, yoxsa uduzar.* "Koroğlu". *Biz əldə edilmiş qələbəni uduzmamaq üçün tədbirlər görməliyik.* M.S.Ordubadi. *Rüstəm bildi ki, işi uduzub.* M.İbrahimov.

◊ **Ağlını uduzmaq** – b a x **ağıl**[1]. [Ələsgər:] *Bir də ağlını uduzma.* Ə.Haqverdiyev.

**UDUZULMA** "Uduzulmaq"dan *f.is.*

**UDUZULMAQ** "Uduzmaq"dan *məch. Oyun uduzuldu. – İşlər belə gedərsə, müvəffəqiyyətin uduzulacağı şübhəsizdir.* M.S.Ordubadi.

**UF, UFF** *nida.* Kədər, təəssüf, məyusluq, ağrı, yorğunluq, bezginlik, bəzən də fərəh, sevinc hisslərini ifadə edir. [Orxan:] *Uff! Ağrıdan sanki çatlayır başım.* H.Cavid. *Kim bilir, yollarında ey rəna; Nə qədər, uf, boyun bükənlər var.* A.Şaiq. *Anketov "uff" eləyib özündən getdi.* Mir Cəlal. // Yüngüllük, xoşlanma, ürayəyatma hisslərini ifadə edir; uxay! *Uf, necə rahat oldum! Uf, adam özünü gecə yüngül hiss edir. Uf, nə sərin hava gəldi.*

**UFACIQ** *sif.* Kiçicik, çox kiçik, çox xırda, çox balaca. *Ufacıq işləri hünər sanma; Belə işlər keçər sühulət ilə.* M.Ə.Sabir. // *Zərf mənasında.* Azacıq, bir az, cüzi. *Sona da Bahadırın əksini ufacıq çəkdirib medalyonda döşündən asırdı.* N.Nərimanov.

**UFAQ** *sif.* Kiçik, balaca, xırda. *Bu kəndin qurtaracağında, meşənin başlanğıcında əski və ufaq daxmada Qızxanım adlı bir qadın 12 yaşlı oğlu ilə yaşayırdı.* S.S.Axundov. *Məhərrəm ufaq zəngi çaldı, otağı sükut bürüdü.* H.Nəzərli.

**UFAQLIQ** *is.* Kiçiklik, balacalıq, xırdalıq.

**UFAQ-TUFAQ** *sif.* Kiçik və əhəmiyyətsiz, xırda-xırda, xırda-xuruş. *Lamədə bəzi ufaq-tufaq qab-qacaq görünürdü.* S.Hüseyn.

**UFAL(A)TMA** "Ufal(a)tmaq"dan *f.is.*

**UFAL(A)TMAQ** *f.* Xırdalatmaq, ovaraq, ya əzərək xırda etmək, xırda-xırda parçalara ayırmaq. *Əlindəki kağıza bükülü ətmək parçasını ufaldaraq balıqlara atar.* H.Cavid.

**UFULDAMA** "Ufuldamaq"dan *f.is.*

**UFULDAMAQ** *f.* Yorğunluq, üzüntü, ağrısızı duyaraq zarımaq, inləmək. *Yaralananlar ufuldayıb ilan kimi qıvrılırdılar.* Çəmənzəminli. [Mürsəl] *ufuldayırdı, çünki yarası zoqquldayırdı.* Ə.Vəliyev.

**UFULTU** *is.* Ufuldama səsi; zarıltı, inilti. *Qaraca qız tamam gecəni ufultu və zarıltı ilə keçirib sübhə yaxın yuxuya getdi.* S.S.Axundov. [Dərviş:] *Ruqiyyədən gələn ah-zar, ufultu bir çibin qədər də qulağımda vızıldamayırdı.* A.Divanbəyoğlu.

**UĞRAMA** "Uğramaq"dan *f.is.*

**UĞRAMAQ** *f.* 1. Rast gəlmək, üz-üzə gəlmək, rastlaşmaq. [Mirzə Səfər:] *Qafiyə tapmaqda çətinliyə uğradıqda iki dəfə qeyzlə təpiyini yerə çırparsan, o saat qafiyə öz-özünə tapılar.* Ə.Haqverdiyev. [Mansur xan:] *Səhərsəhər nə gözəl bir şikara uğramışam.* C.Cabbarlı.

2. Düçar olmaq, məruz qalmaq, giriftar olmaq. *Bəlaya uğramaq. Fəlakətə uğramaq. Müvəffəqiyyətsizliyə uğramaq. – Keşlə yaxınlığında qatarımız dayanmağa məcbur oldu, irəlidəki qatar qəzaya uğramışdı.* S.Hüseyn.

**UĞRAŞMA** "Uğraşmaq"dan *f.is.*

**UĞRAŞMAQ** *f.* 1. Uzun müddət bir şeylə məşğul olmaq, çalışmaq, bir şeyə başı qarışmaq. [Naib:] *Bu cəbr, həndəsə bilməm nə demək? Uğraşan beynimi incitmiş olur.* H.Cavid. *Əvvəllər Nəriman dərs ilə uğraşmağa çalışdı.* Mir Cəlal.

2. B a x **uğramaq** 1-ci mənada. *Bir rahgüzərdə ol nigarə; Uğraşdı və qıldı bir nəzərə.* Füzuli.

3. Gəzmək, dolanmaq, keçərkən müvəqqəti bir yerdə olmaq, durmaq. *Mən ki bir şux madmazel eşqində əldən getmişəm; Şəhrdən-şəhrə gəzib Avropanı uğraşmışam.* M.Ə.Sabir.

**UĞRATMA** "Uğratmaq"dan *f.is.*

**UĞRATMAQ** *f.* Düçar etmək, giriftar etmək, məruz etmək, uğramasına səbəb olmaq. *Bəlaya uğratmaq. Məğlubiyyətə uğratmaq. Müvəffəqiyyətsizliyə uğratmaq.* – [Kərəm:] *Pəncərəyə çəkib pərdə; Sən uğratdın məni dərdə.* "Əsli və Kərəm".

**UĞRUNDA** *qoş.* ...yolunda, ...üçün, ...xatirinə, ...naminə. *Vətən uğrunda. Sülh və azadlıq uğrunda mübarizə. – Gözəldir bir uca əməl bəsləyib; Bu əməl uğrunda qan-tərə batmaq.* M.Müşfiq. *Bu dünyada insan oğlu beş gün qonaqdır; El uğrunda qurban gedən həmişə sağdır.* M.Rahim.

**UĞULDAMA** "Uğuldamaq"dan *f.is.*

**UĞULDAMAQ** *f.* 1. Uğultu səsi çıxarmaq. *Külək uğuldayır.* – [Qəhrəman:] *Kənarda buzlu ruzigar şikayətli bir yaralı heyvan iniltisi ilə telefon tellərinə toxunur və uğuldayırdı.* H.Nəzərli. *Çılğın kimi ruzigar uğuldar; Qar parçaları səmaya firlar.* A.Şaiq. // Bu cür səsin qulaqda hiss olunması haqqında. *Bünyadın qulaqları uğuldayırdı.* Ə.Əbülhəsən. *Onun qulaqları uğuldadı, elə bil qorxunc, dəhşətli əks-səda eşidilirdi.* Q.İlkin.

2. Göyərçinlərin çıxartdığı səs haqqında – quruldamaq. *Məscidin damındakı göyərçinlər kəsik-kəsik uğuldayırdılar.* M.Hüseyn.

**UĞULTU** *is.* 1. Qulağa gələn sürəkli, gurultulu, boğuq səs. *Damda, bacada həzin gurultu; Səhraları inlədir uğultu.* A.Şaiq. *Susmuş izdiham içərisindən yenidən bir uğultu qopdu.* Ə.Məmmədxanlı.

2. Arıların çıxardığı səs; vızıltı.

**UĞUNMA** "Uğunmaq"dan *f.is.*

**UĞUNMAQ** *f.* Adətən gülməkdən uğunmaq, uğunub getmək şəklində: gülməkdən qəşş eləmək. *Mədinənin zarafatı Vaqifin çox xoşuna gəldi, uğunub getdi.* Çəmənzəminli. [Buğacın] *qıdığı tutub gülməkdən uğunardı.* M.Rzaquluzadə.

**UĞUR** *is.* Bəxt, səadət, xoşbəxtlik. [Sərətan Afətə:] *Uğurlar dilərəm ürəkdən sizə; Görüm çatasınız məqsədinizə!* M.Rahim. *Rübabə baxıb fərəhlənir, uğura doğru getdiyinə inamı artırdı.* Mir Cəlal. [İsmayıl:] *Uğrumuza əcəb şey çıxdı!* P.Makulu. // Bir işin, arzunun və s.-nin müvəffəqiyyətli sonu, aqibəti, müsbət nəticəsi; müvəffəqiyyət, nailiyyət, qələbə. *İşdə uğur diləmək. Hücum uğurla nəticələndi.*

◊ **Uğur(lar) olsun!** – bir işə iqdam edən, başlayan adama müvəffəqiyyət, qələbə, səadət, xoşbəxtlik arzusu bildirir. *Yaxşı yollar, yaxşı uğurlar olsun!* M.S.Ordubadi. *Gedin, dostlar, uğur olsun; Pozulmasın andınız.* S.Rüstəm. **Uğura qənşər gələsən!** – b a x **uğur olsun!** [Qoca:] *Uğura qənşər gələsən, oğul!* M.Rzaquluzadə. **Uğur(lar) demək** – uğur arzu etmək. *Əqlimlə biliyim tutub qol-qola; Uğurlar deyərək düşdüm bu yola.* A.Şaiq. *Qoy səsindən gülsün Vətən; Ellər baxıb uğur desin.* S.Vurğun. **Uğruna gəlmək** – bəxtinə çıxmaq, qabağına çıxmaq. [Sultan bəy:] *Hanı bir elə arvad ki uğruma gələ idi, ala idim!* Ü.Hacıbəyov.

**UĞURLU** *sif.* Müvəffəqiyyətli, sonu, nəticəsi yaxşı olan, müsbət nəticələnən. *Uğurlu nəticələr. Uğurlu ov. Zəhmətinin nəticəsi uğurlu oldu. Hücum uğurlu* (z.) *bitdi. – Kazım fəqət xəbərsizdi bu işdən; Xəbərsizdi bu uğurlu gedişdən.* M.Müşfiq. *Gümanlı-gümansız bu axtarışlar; Bəzən uğurludur, bəzən uğursuz.* B.Vahabzadə. // Xoşbəxtlik gətirən; xoşbəxt, səadətli, şükümlü. *Sən gəzdiyin yerlər gül-çiçək açar; Çünki uğurludur ayağın sənin.* S.Vurğun. *Ölkəmizin günləri bir-birindən nurludur; Qayəmiz aydın, açıq, yolumuz uğurludur.* R.Rza. □ **Uğurlu olsun!** – uğur arzusu bildirir. *Dağ-dərəni addan sən; Keç alovdan, oddan sən; Yolun uğurlu olsun; Gözlə özün yaddan sən.* (Bayatı). *Ey yolçu, uğurlu olsun səfərin! Buludsuz günəşlə doğsun səhərin!* A.Şaiq. *Yaxşı, səfərin uğurlu olsun, Ələmdar qardaş! – deyə, dəllək özünü ələ almağa çalışır, ancaq bacarmırdı.* S.Rəhimov.

**UĞURSUZ** *sif.* 1. Bədbəxtlik gətirən, bədbəxtliyə səbəb olan; şükümsüz, məşum, bədşüküm, bədbəxt, fəlakətli. *Qonaqsız ev uğursuz olar.* (Ata. sözü). [Hannanın] *gözəl səsi mənim qulaqlarımda bir bayquş səsindən daha uğursuz idi.* M.S.Ordubadi. *Qardaşlarımdan üçü müharibədən qayıtmamış, biri öz əcəli ilə vəfat etmiş, Səmədin atası Mədəd isə uğursuz bir təsadüfün qurbanı olmuşdu.* İ.Hüseynov. // Nəhs, mənhus, pis. *Uğursuz bir gündə acı bir külək; Dağları, daşları bir yerdə qatdı.* S.Vurğun. // Bədbəxt, talesiz, bəxtsiz. [Vəzir:]

*Xeyir olsun, ah, gəlir uğursuz insan; Gözündə oynayır ehtiras, al qan.* A.Şaiq. *O öz həyatını, cavan ömrünü; Uğursuz taleyin hökmünə verdi.* B.Vahabzadə.

2. Uğursuzluqla nəticələnən, heç bir müsbət nəticə verməyən, heç bir şeylə nəticələnməyən; müvəffəqiyyətsiz. *Uğursuz təşəbbüs. Uğursuz uçuş. Uğursuz axtarışlar. Bütün cəhdləri uğursuz* (z.) *qurtardı.*

**UĞURSUZLUQ** *is.* 1. Məşumluq, şükümsüzlük, bədbəxtlik, fəlakət, bəxti gətirməmə. *Adamlar həmişə bir fəlakətə, uğursuzluğa düçar olanda kor şeytandan görərdilər.* Mir Cəlal.

2. Müvəffəqiyyətsizlik, nəticəsizlik. *Cəhdlərin uğursuzluğu. Təşəbbüsün uğursuzluğu. Axtarışların uğursuzluğu.*

**UXAY** *nida.* Məmnunluq, cana sinmə, xoşlanma hisslərini ifadə edir. [Təlxək əcinnə:] *Uxay! Canıma yayıldı...* Ə.Haqverdiyev. [Səttar:] *Uxay deyib, tirtap ayaqlarımı uzatdım, amma gözümə yuxu getmədi.* Ə.Əbülhəsən.

**UKLAD** *is.* Quruluş, sistem, qayda, üsul, forma.

**UKRAYNACA** *sif.* və *zərf* Ukrayna dilində. *Ukraynaca-rusca lüğət. Ukraynaca danışmaq.*

**UKRAYNALI** *is.* Ukraynanın əsas əhalisini təşkil edən Şərqi Slavyan xalqı və bu xalqa mənsub adam.

**UQOR** *is.* Mərkəzi və Şərqi Avropada, habelə Asiyanın şimal-qərbində yaşayan xalqlar.

**UQRO-FİN** bax **fin-uqor**.

**ULAQ** *is.* Yük və ya minik heyvanı. *Ulaqları o tərəfdəki otluğa buraxıb gələn Yusif atasının yanında durdu.* Ə.Abasov. // Eşşək. *Əziziyəm, nə dəm var; Nə söhbət var, nə dəm var; Dəyirmana getməyə; Nə ulaq var, nə dən var.* (Bayatı). *Bəli, Məmmədhəsən əmi bir ulaq aldı. Amma bu ulaq başıbəlalı ulaq imiş.* C.Məmmədquluzadə.

**ULAQÇI** *is. köhn.* Keçmişdə: ulaqla yük daşıyan adam. *Ulaqçı çuvalları ulağın üstünə atıb, heyvanın ombasından bir dəyənək endirib həyətdən çıxdı.* C.Məmmədquluzadə.

**ULAMA** 1. "Ulamaq"dan *f.is.*

2. İt, qurd və bəzi başqa heyvanların, habelə bayquşun çıxardığı sürəkli inilti səsi. *Çaqqal ulaması. Uzaqdan canavarın ulaması eşidilir. – Oradan-buradan gecəquşlarının iniltiyəbənzər ulamaları eşidilirdi.* M.Rzaquluzadə.

**ULAMAQ** *f.* 1. Ulama səsi çıxarmaq. *İt ulayır. Bayquş ulayır. – Dərələrdə ulardı çaqqallar; Zənn edərdin ki, bir çocuq ağlar.* A.Səhhət. // Ulama səsinə bənzər səs çıxarmaq; vıyıldamaq, uvuldamaq. *Ancaq quduz xəzri dəqiqə-dəqiqə ara verib, damlar başında ulayırdı.* S.M.Qənizadə. *Kəsməyib xəzri hələ, ac canavartək ulayır.* S.Rüstəm.

2. *dan.* Səslə ağlamaq, zarıldamaq. *Nə ulayırsan, bəsdir! Bu uşaq nə üçün səhərdən belə ulayır?*

**ULAN** *is.* [*pol.,* əsli türkcədən] *tar.* Çar Rusiyası ordusunda və bəzi xarici ordularda yüngül süvari əsgəri, ya zabiti. *Ulan polku. – Doğrudan da, nahar yeyilən kimi uzunbığlı və mahmızlı yerölçən Şmidt və kapitan-ispravnikin bu yaxınlarda ulan hissəsində qulluğa girmiş on altı yaşlı oğlu gəlib çıxdı.* Puşkindən. *İstiraja durur Qozluğun üstə; Ulan kazakları burda on dəstə.* H.K.Sanılı.

**ULARTI** *is.* Ulama səsi, ulama. *Midhət .. bayquşların ulartısını eşitməməsi üçün öz zədəli maşınını .. düşmən qırıcısına elə vurdu ki, qulaqları dərhal batdı.* Ə.Vəliyev.

**ULAS** *is. bot.* Tozağacı fəsiləsindən dağlıq yerlərdə bitən ağac; vələs. *Ulas meşəsi. – Uzun ulas ağacı öz kökündən qopub yerə gəlmişdi.* S.Rəhimov.

**ULAŞMA¹** "Ulaşmaq¹"dan *f.is. Uzaqlardan ara-sıra canavar ulaşması eşidilir.* Q.İlkin.

**ULAŞMA²** "Ulaşmaq²"dan *f.is.*

**ULAŞMAQ¹** *qarş.* Ağız-ağıza verib ulamaq, hamı birdən ulamaq.

**ULAŞMAQ²** *f.* Yetişmək, görüşmək, qovuşmaq. *Vəfa qıl bir vəfadarə; Ulaşma hər biiqrarə; Mətain atma bazarə; Xəridar olmayan yerdə.* M.V.Vidadi.

**ULDUZ** *is.* 1. Öz təbiəti etibarilə günəşə bənzəyən və gecələr göydə parıldayaraq nöqtə kimi görünən göy cismi. *Göydə ulduzlar parlayır. – Uzaq üfüqdə dağlar qaralır, göydə tez-tez ulduz uçurdu.* İ.Əfəndiyev. *Bir-birinə sığınan ulduzlar sayrışmağa başladı.* B.Bayramov.

2. *məc*. Hər hansı bir sahədə məşhur, tanınmış şəxs haqqında. *Elm aləminin məşhur ulduzları. Kino ulduzu* (*ən məşhur kinoartist*). *Futbol ulduzu.*

3. Dairə üzrə bərabər ucuşiş çıxıntıları olan həndəsi cisim; mərkəzdən çıxan şüaları olan fiqur; həmin fiqur şəklində olan şey. *Beşguşəli ulduz. Ulduz şəkli çəkmək.* //Həmin şəkildə olan fərqlənmə nişanı. *Marşal ulduzu.* // Təşbehlərdə: parlayan şey haqqında. *Araz öz adını elə cəsarətlə dedi ki, fəhlələrin gözləri onun ulduz kimi yanan parlaq gözlərinə dikildi.* A.Şaiq.

◊ **Ulduz ulduzu çağırır** *şair*. – gecə ulduzların par-par parıldaması haqqında. *Onlar kəndə yetişəndə artıq gecə idi. Göydə ulduz ulduzu çağırırdı.* M.Hüseyn. **Ulduzu (ulduzları) barışmaq** – bir-birilə dil tapmaq, yola getmək, bir-birilə xoş keçinmək. [Pakizə:] ..*Yox, bunların ulduzu barışıb, – deyə, o yoxsul ailənin keçirdiyi bu sadə həyata heyrət edirdi.* A.Şaiq. [Qaraş Mayaya:] *Sağ ol ki, görən kimi ulduzun barışdı, axı, gəlin-qayınana işi uzun işdir.* M.İbrahimov. **Ulduzu batmaq** – bəxti sönmək, şöhrətdən düşmək, nüfuzunu itirmək, gözdən düşmək. *Bircə günün içində xalqı tir-tir əsdirən qorodovoyun ulduzu batdı.* S.Rəhman. **Ulduzu doğmaq** – xoşbəxtliyə çıxmaq, bəxti üzünə gülmək. [Cəmil bəy həqarətlə:] *Demək ki, taleyimizin ulduzu doğmağa başlamış da xəbərimiz yox..* H.Cavid.

**ULDUZAOXŞAR, ULDUZVARİ** *sif.* Ulduz şəklində olan. *Ulduzvari nişan.*

**ULDUZLU** *sif.* Ulduzlarla örtülü, ulduzlarla dolu, çoxlu ulduz olan. *Ulduzlu göy. – Sərin və ulduzlu bir gecə idi.* A.Şaiq. *Ulduzlu ayaz gecə Muğanın üstünü almışdı.* M.İbrahimov. // Üstündə ulduzaoxşar şəkil, ya naxışları, bəzəkləri olan. *Ulduzlu dəsmal. Ulduzlu parça*. // Üstündə ulduz nişanı olan. *Ulduzlu təyyarə. – Ulduzlu şahinlər indi məzar qoxusu gətirən kor bayquşları ovlamaq üçün bu gecə qalxmışdılar.* S.Rəhimov.

**ULDUZNİŞAN(LI)** *sif.* Üstündə ulduz şəklində nişanı olan. *Ulduznişan papaq. Ulduznişan bayraq. – İndi Əşrəf də ulduznişan bir təyyarədə uçur*(*du*). Mir Cəlal.

**ULDUZŞƏKİLLİ** b a x **ulduzaoxşar**.

**ULDUZU** b a x **ulduzaoxşar**. [Ananın] *yarıçılpaq vücuduna amansız qış gecəsi başqa bir don biçir, başqa bir örtü geyindirir, şaxtanın buz barmaqları ona ulduzu naxışlardan zərif bir libas toxuyur..* Ə.Məmmədxanlı.

**ULTİMÁTUM** [*lat.* ultimatum] Dövlətlərarası münasibətlərdə: bir dövlətin başqa dövlətə verdiyi qəti tələb (ultimatumun mahiyyəti ondan ibarət olur ki, o heç bir mübahisə və etiraza yol vermir və irəli sürülən tələblər müəyyən müddət ərzində yerinə yetirilmədiyi təqdirdə dərhal qüvvə və s. tədbirlər tətbiqini nəzərdə tutur. // *məc*. Ümumiyyətlə, hədə-qorxu ilə verilən tələb. *Hacı titrəyə-titrəyə gəldisə də, bəyə bir ultimatum gətirdi.* Mir Cəlal. *Şahpərinin bu gün ultimatum şəklində dediyi bu sözlər qızın ürəyini, necə deyərlər, şan-şan eləmişdi*. B.Bayramov. □ **Ultimatum vermək** *məc*. – hədə-qorxu gəlmək.

**ÚLTRA** [*lat.* ultra] Siyasətdə: ifrat, ifratçı.

**ultra**... [*lat.* ultra] Bir sıra mürəkkəb sözlərin "üstün", "son", "ifrat" mənasında olan birinci tərkib hissəsi; məs.: ultrabənövşəyi, ultramikroskop.

**ULTRABƏNÖVŞƏYİ: ultrabənövşəyi şüalar** *fiz.* – gözlə görünməyən elektromaqnit şüaları. *Ultrabənövşəyi şüalar gözlə görünməyən qısadalğalı şüalardır.* R.Hüseynov.

**ULTRAQISA** *fiz*. Son dərəcə qısa. *Boyu bir metrdən 10 metrədək olan dalğalar ultraqısa dalğalar adlanır.*

**ULTRAMİKROSKÓP** [*lat*. ultra və mikroskop] Adi mikroskoplarda görünməyən ən kiçik zərrəcikləri görməyə imkan verən mikroskop. *0,1 mikrondan 0,001 mikrona qədər böyüklüyü olan hissəcikləri ultramikroskop vasitəsilə görmək olur.* H.Şahtaxtinski.

**ULU** *sif.* Çox böyük, ən böyük, böyük. *Ulu divanlarda çəkilir adım; Ərşə bülənd oldu dadü fəryadım*. Qurbani. *Yenilməz bir xalqıq, əcdadı ulu; Qoruyur sinəmiz vətən mülkünü*. Ə.Cəmil.

**ULULUQ** *is.* Böyüklük, əzəmətlilik, yüksəklik. *Ululuq istərkən qulluq eylə; Ayaq bir-bir basarlar nərdibanə*. Xətayi. [Məsmə:] *Keçmişdə deyərdilər: – Nə hal ilədir; Nə mal ilədir; Fəqət ululuq; Kamal ilədir*. Mir Cəlal.

**ULUS** *is. qəd.* El, oba, yurd, kənd. *Vətənimdən, ulusumdan yad oldum; Yada salmaz qohum, qardaş, el məni.* "Koroğlu".

**UMAC** *is.* Ovulmuş undan bişirilən duru xörək və bu xörək üçün üstünə su səpilərək hazırlanan xəmir ovuntularının özü (xalq arasında adətən tərləmək üçün soyuq dəymiş adamlara verilir). [Ağa Kərim xan:] *..Haflama gürzə, qurutlu aş, mal ətinin küftəsi, umac – bunlar hamısı ürəktutan şeylərdir.* N.Vəzirov. [Nəcəfalı Şahmara:] *Nənən kəklikotu dəmləsin, bir də əvəlikli umac bişirsin, tərləyib ayılarsan.* B.Bayramov.

**UMACAQ** *is.* Umulan, gözlənilən, könüldə tutulan, istənilən, intizarı çəkilən, ürəyindən keçən şey. [Vidadi:] *Sən də qurtarmasan Vaqifi dardan; Yoxdur umacağım pərvərdigardan.* S.Vurğun. [Qəhrəman] *bilirdi ki, atasının ondan kənar və başqa umacağı yoxdur.* S.Rəhimov.

**UMACAŞI** *is.* Umacdan bişirilən duru xörək; umac.

**UMMAQ** *f.* Bir şeyi könlündən keçirmək, ürəyində tutmaq, olmasını istəmək, arzu etmək, ümid etmək. *Uman yerdən küsərlər.* (Məsəl). *Bəşər nicat umur bayrağımızdan; Səadət açarı bizdədir ancaq.* S.Rüstəm. *Əvəzin oğlundan böyük şey ummağa haqqı var idi.* Ə.Vəliyev.

**UMSUQ** *sif.* Öz ümidində aldanmış; intizarı, gözləməsi, arzusu boşa çıxmış. ◻ **Umsuq etmək** – ümidini boşa çıxarmaq, aldatmaq, umsundurmaq. *Umsuq etdin, məni qoydun avara; Dedim, yəqin bir şir, aslandı indi.* "Qurbani". **Umsuq olmaq** – ümidi boşa çıxmaq, aldanmaq, gözü qalmaq, umsunmaq.

**UMSUNDURMA** "Umsundurmaq"dan *f.is.*

**UMSUNDURMAQ** *f.* Ümidini boşa çıxarmaq, aldatmaq, umsuq etmək.

**UMSUNMA** "Umsunmaq"dan *f.is.*

**UMSUNMAQ** *f.* Ümidi boşa çıxmaq, aldanmaq, umsuq olmaq, gözü qalmaq, ümidində aldanmaq.

**UMSUTMA** "Umsutmaq"dan *f.is.*

**UMSUTMAQ** *f.* Umsuq etmək, umsuq qoymaq, ümidini boşa çıxarmaq; umsundurmaq.

**UMU-KÜSÜ** *is.* Umma, küsmə, incimə, şikayətlənmə, giley. *Töhmətdən çox umu-küsüyə bənzəyən bu sözləri deyərkən* [Xanların] *səsi titrədi.* M.Hüseyn. *Küçə dinmədi; Sükut etdi; Müdrik bir insan kimi; Sanki eşitmədi; Mənim umu-küsümü.* R.Rza. ◻ **Umu-küsü etmək** – şikayətlənmək, narazılıq etmək, narazılığını bildirmək, incikliyini bildirmək, gileylənmək. *Nəriman umu-küsü elədi: – Elə olar, elə olar! Daha bizləri tanımazsan katib olandan sonra..* Mir Cəlal. *Tapdıq .. umu-küsü etdi.* Ə.Əbülhəsən.

**UMULMA** "Umulmaq"dan *f.is.*

**UMULMAQ** "Ummaq"dan *məch. Söylə, gözəllərin dodaqlarından; Bu oynaq gülüşlər umulmuşmudur?* M.Müşfiq. ◻ **Umulmadığı yerdən** – gözlənilmədiyi halda. *Bəzən əsla umulmayan yerdən; Nə qədər bəxtiyar olur insan.* H.Cavid.

**UMUZ** *is.* Çiyin. [Zaman:] *Mən tüfəngi umuzuma sıxaraq gedirdim.* C.Cabbarlı. *Yun şalını umuzundan alıb kreslonun söykənəcəyinə buraxdı.* Ə.Əbülhəsən.

**UMUZDURMA** "Umuzdurmaq"dan *f.is.*

**UMUZDURMAQ** *f.* Umsuq etmək, umsutmaq.

**UN** *is.* 1. Taxıl bitkiləri dənlərinin toz halına salınmış məhsulu. *Buğda unu. Qarğıdalı unu. Un çuvalı. – Bu dəfə on pud unun çörəyi gərək yapılaydı.* C.Məmmədquluzadə. *Havada buğda ununun qoxusu duyulurdu.* İ.Əfəndiyev.

2. Toz halına salınmış heyvan sümüyü, ya mineral maddə. *Sümük unu. Fosfor unu.*

**UNİFİKÁSİYA** [*lat.* unus – bir və facere – etmək, yaratmaq] Ümumi bir qaydaya salma, hamısını bir şəklə, bir qaydaya salma. *Orfoqrafiyanın unifikasiyası.*

**UNİFÓRMA** [*fr.*] Rəsmi paltar, geyim. *..Helli, İbrahim Fövzi də öz yavərləri ilə bərabər rəsmi və hərbi uniformada idi.* M.S.Ordubadi. [Gənc] *rus müəllimlərinə məxsus uniforma geymişdi.* P.Makulu.

**UNİKAL** *sif.* [*lat.*] Nadir, yeganə.

**UNİON** *is.* [*lat.*] İttifaq, birlik.

**UNİSÓN** *is.* [*ital.*] 1. *mus.* Ahəng uyğunluğu.

2. *fiz.* İki titrəyiş mənbəyində tənliklər bərabərliyi.

3. *məc.* Fikir dəstəkliyi, fikir birliyi; yekdillik.

**UNİTÁR** *sif.* [*fr.*] Birləşmiş, vahid.

**UNİTÁZ** [firmanın adından – Unitas] Kanalizasiyası olan evlərin ayaqyollarında (tualetlərində) çirkabların axıb getməsi üçün xüsusi quruluşlu çanaq.

**UNİVERMÁQ** *is.* "Universal mağaza" söz birləşməsinin ixtisar forması. *Mərkəzi şəhər univermağı.*

**UNİVERSÁL¹** *sif.* [*lat.*] 1. Müxtəlifcəhətli, hərcəhətli, hərtərəfli, hər şeyi qavrayan. *Universal adam. Universal peşə. Universal bilik.*

2. Bir çox məqsədlər üçün yararlı, müxtəlif işlərdə istifadə edilə bilən, müxtəlif vəzifələr görə bilən. *Universal maşın. Universal dəzgah. Universal traktor. Universal yapışqan.*

◊ **Universal mağaza** – ən müxtəlif sənaye malları satılan böyük mağaza; univermağ.

**UNİVERSAL²** *sif.* [*lat.*] 1. Öz sənətinin bütün ixtisaslarına yaxşı bələd olan işçi. *Universal çilingər. Universal konstruktor.*

2. *astr. geod.* Həm şaquli, həm də üfüqi səthdə bucaqları ölçmək üçün alət.

**UNİVERSALLIQ** *is.* 1. Biliyin ən müxtəlif sahələrinə bələdlik, hərtərəfli məlumatı olma; hərtərəflilik, hərcəhətlilik.

2. Universal şeyin hal və keyfiyyəti. *Maşının universallığı.*

**UNİVERSÁM** [*rus*. универсальный магазин самообслуживания] Özünəxidmət üsulu ilə işləyən universal mağaza.

**UNİVERSİTÉT** [*lat.* universitas – toplu, məcmu] Tərkibində müxtəlif ictimai və təbiiyyat-riyaziyyat şöbələri (fakültələri) olan elmi təmayüllü ali məktəb. *Bakı Dövlət Universiteti.*

**UNİYA** *is.* [*lat.*] 1. Birlik, birləşmə, ittifaq.

2. Katolik kilsəsinin Roma papasının başçılığı ilə pravoslav kilsəsinin bir hissəsilə birləşməsi.

**UNLAMA** "Unlamaq"dan *f.is.*

**UNLAMAQ** *f.* Üstünə un səpmək, un tökmək. *Xəmiri unlamaq.*

**UNLU** *sif.* Üstünə un səpilmiş (tökülmüş); una batmış. *Üstü-başı bütöv unludur.*

**UNLUCA** *is. bot*. Şoran torpaqlarda yayılmış ot və ya yarımkol bitki.

**UNLUQ** *is.* Dəyirmanın un tökülən çuxur yeri. *Qarı unluğun dibini, yan-yörəsini silib-süpürdü, iki ovuc un yığdı.* (Nağıl).

**ÚNSİYA** *is.* [*lat.*] 1. Bir sıra ölkələrdə müxtəlif (28, 35 qramadək) çəki vahidi.

2. 1881-ci ilədək işlənmiş köhnə italyan, ispan, Meksika, Argentina, Boliviya qızıl, Mərakeş gümüş pulu (sikkəsi).

**ÚNTA** *is.* Maral, qoyun və s. dərisindən uzunboğaz isti çəkmə.

**ÚNTER** *is.* [*alm.*] Xarici ölkə ordularında aşağı komanda heyətinə mənsub hərbi rütbə.

**UNUDULMA** "Unudulmaq"dan *f.is.*

**UNUDULMAQ** *məch*. Yaddan çıxarılmaq, yaddan çıxmaq. *Bir az sonra Xədicənin xəstəliyi tamamilə unuduldu*. S.Hüseyn. *Planda heç bir şey unudulmamış, hətta yeni şəhərdə 60 min ağac əkmək belə nəzərdə tutulmuşdu.* Ə.Sadıq.

**UNUDULMAZ** *sif.* Unudula bilməyən, yaddan çıxarıla bilməyən, həmişə yadda qalan, yadda qalmalı olan; xatirdən silinməz. *Unudulmaz dost* (*yoldaş*). *– Kənd həyatında – təbiətin o zəngin və geniş qucağında nə qədər canlı lövhələr, unudulmaz xatirələr vardır!* A.Şaiq. *Doğrudan da yaşlandıqca Qaraş və Pərşan Rüstəmin ocağına unudulmaz bir sevinc, xoş bir şadlıq gətirmişdi.* M.İbrahimov.

**UNUDULMUŞ** *f.sif.* Yaddan çıxmış, yaddan çıxarılmış. *Unudulmuş hadisələr*. – [Züleyxa] *unudulmuş günləri xatırlayır, hər bir nöqtəsini təhlil edir və qibtə ilə düşünürdü.* Çəmənzəminli. *Hər daşı qaldırıb altına baxsan; Ordan unudulmuş bir nalə gəlir*. S.Vurğun.

**UNUTDURMA** "Unutdurmaq"dan *f.is.*

**UNUTDURMAQ** *icb.* Unutmağa, yadından çıxarmağa məcbur etmək, unudulmasına, yaddan çıxmasına səbəb olmaq. *Bu yerlərin səhərləri, axşamları mənə hər şeyi unutdururdu*. A.Şaiq. *Yanına gələnlər isə şairin iztirablarını unutdurmağa çalışır, xəstəlikdən yox, başqa, ürəkaçan söhbətlər edirdilər.* Mir Cəlal.

**UNUTQAN** *sif.* Tez yadından çıxaran, unudan, yadında saxlaya bilməyən, yaddaşı olmayan, huşsuz. *Unutqan adam.*

**UNUTQANLIQ** *is.* Unutqan adamın hal və keyfiyyəti; yaddaşsızlıq, huşsuzluq. [Yaşlı kişi:] *Əgər həmin qulluqçu ikinci dəfə də belə bir unutqanlıq etsə idi,* [tacir] *haqq-hesabını verməklə* "*xoş gəldin!*" *– deyib qovardı*. S.Hüseyn.

**UNUTMA** "Unutmaq"dan *f.is.*

**UNUTMAQ** *f.* 1. Yaddan çıxarmaq, yadından çıxmaq, xatirindən çıxmaq (çıxarmaq). *Nə oldu bülbülə kim, qıldı gülüstan tərkin? Unutdu güllərini, etdi aşiyan tərkin.* X.Natəvan. // Lazımi anda, yeri gələndə yada salmamaq, nəzərindən qaçırmaq. *Yoldan keçərkən bizə baş çəkməyi unutdu. Gedəndə qapını bağlamağı unutma!* – [Süleyman:] *Amma bax unutma sən, unutma sən, bizləri sən; Görəndə qaşıqara, gözüqara qızları sən!* Ü.Hacıbəyov. // Nəzərdən (nəzərindən) qaçırmaq. *Unutma ki, sabah iclas günüdür. Az qala unutmuşdum. – Ancaq unutma ki, sənin uşaqların var.* M.Hüseyn. [Muxtar Firəngizə:] *Sən böyük bir rayonun rəhbəri olduğunu, təəssüf ki, unudursan.* B.Bayramov.

2. Saymamaq, hesablaşmamaq, riayət etməmək. *Ədəb qaydalarını unutmaq. Heysiyyətini unutmaq.*

3. Təsadüfən yadından çıxararaq bir yerdə qoymaq, özü ilə götürməmək. *Stolun açarını unutdum, evdə qoydum.*

◊ **Duz-çörək unutmaq** – nankorluq etmək, nankor olmaq, edilən yaxşılığı yadından çıxarmaq. **Özünü unutmamaq** – özünü yaddan çıxarmamaq, öz xeyrini əldən buraxmamaq.

**UPUZUN** *sif.* Çox uzun, lap uzun. *Upuzun ağac.*

**UR** *is.* Bədənin hər hansı bir yerində çıxan iltihabsız şiş.

**URA** *is.* Tərəvəzin, meyvənin ən axırda dériləni. *Gedər bostan urası; Qalar üzün qarası.* (Ata. sözü).

**UR(R)A!** *nida.* 1. Hücum zamanı qoşunların döyüş nidası. *Çalınmaqda şeypurlar, naylar; Ucalmaqda ləşkərdən urraylar.* M.Ə.Sabir. *Soldat "ura" deyib keçdi hücuma; Töküldü qanları torpağa, quma.* H.K.Sanılı.

2. Hərarətli alqış və heyranlıq ifadə edir: əhsən! afərin! [El:] *Var olsun yeni dünyanın yenilməz mübarizi Elxan! Urra!* C.Cabbarlı. *Hamı bir ağızdan "urra" deyib piyalələri qaldırdılar.* Ə.Vəliyev.

**URÁN** [*yun.* uranos – göy] Radioaktiv kimyəvi element – atom enerjisi hasil etmək üçün xam maddə (nüvə silahında partlayıcı maddə kimi istifadə olunur).

**URBANİZÁSİYA** [*lat.* urbanus] Ölkənin və ya rayonun həyatında şəhərlərin əhəmiyyətinin artması, sosial-iqtisadi inkişafla əlaqədar şəhər əhalisinin çoxalması prosesi.

**URBANÍZM** [*lat.* urbanus – şəhər] *kit.* 1. Maddi və mənəvi mədəniyyətin iri şəhərlərdə cəmləşdirilməsini və kəndin zərərinə olaraq şəhərlərin inkişafının gücləndirilməsini tələb edən konsepsiya.

2. İri sənaye və ticarət şəhərlərinin həyatını təsvir edən incəsənət və ya ədəbi əsər.

**URDU** Pakistanın dövlət dili.

**URLAMA** "Urlamaq"dan *f.is.*

**URLAMAQ** *f. məh.* Qoyunları sulamağa çağırmaq, səsləmək.

**URLU** *sif.* Uru olan, şişləri olan.

**URNA** *is.* [*lat.*] 1. Yandırılmış cənazənin külünü saxlamaq üçün qab.

2. Seçki qutusu; səsvermə qutusu.

**UROLÓGİYA** [*yun.* urol və logos] Tibb elminin sidik sistemi xəstəlikləri və onların müalicə və profilaktikası ilə məşğul olan sahəsi.

**UROLOJİ** *sif.* [*yun.*]. Urologiyaya aid olan. *Uroloji müayinə. Uroloji klinika.*

**URÓLOQ** [*yun.*] Urologiya mütəxəssisi; həkim.

**URUQ** *is.* Ailə. *Uruğum olsun, Urumda olsun.* (Ata. sözü). // Qəbilə, tayfa.

**URUQVAYLILAR** *is.* Uruqvayda yaşayan əhali.

**URUS** "Rus" sözünün canlı dildə işlənən forması. [Məşədi İbad:] *Bax, mən iki yaşında urus balası görmüşəm ki, başı ağappaq qar kimi.* Ü.Hacıbəyov.

**URVA** *is.* Xəmiri kündələyərkən və ya yayarkən ələ yapışmaması üçün onun üstünə səpilən az un. *İki evin urvasından bir fətir olar.* (Ata. sözü).

**URVALIQ** *sif.* və *is.* Urva kimi istifadə edilən, işlədilən. *Nə od var, nə ocaq, nə urvalıq un; Bürüşüb bir küncdə yamaqlı xurcun.* S.Vurğun. [Paşa bəy:] *Yaxşı deyiblər ki, evində yoxdur urvalıq, könlündən keçir darğalıq.* Ə.Vəliyev.

**URVAT** *is. dan.* Hörmət, izzət, ehtiram, sayğı; təsir, nüfuz, etibar. *Keçəl Həmzə sayılmayan, urvatı olmayan bir adam idi.* "Koroğlu". *Qəhrəman oxuyandan qabaq Rüstəmin bu evdə heç olmasa urvatı vardı.* S.Rəhimov.

**URVATLI** *sif. dan*. Sayılan, hörməti olan, hörmətli, nüfuzlu, etibarlı. [Qarakişi:] *Bax, Əsəd kişi hamıya yaxşılıq elədi. Ölüsü də urvatlı oldu.* B.Bayramov.

**URVATSIZ** *sif. dan*. Urvatı, hörməti, nüfuzu olmayan; sayılmayan, hörmətsiz, etibarsız. *Gör nə qədər urvatsızıq ki, Qəni bəyin evinin yanmasında da bizdən şübhələnirlər.* Ə.Vəliyev.

**URYÁDNİK** [*rus.*] *tar.* Çar Rusiyasında qəza polisinin aşağı rütbəli xidmətçisi. *Lap elə axşamüstü, günün gedən vaxtı uryadnik kişini beləcə döydüyü yerdə, Abbasın cini toplanıb kəlləsinə çıxmışdı.* S.Rəhimov. *Uryadnik atını İskəndərin üstünə şığıdaraq qışqırdı: – Biyara!* M.Hüseyn.

**US** *is. qəd.* 1. Ağıl, kamal, zəka, dərrakə, fərasət, idrak.

2. Ədəb, tərbiyə.

**USANDIRICI** *sif.* Usandıran, bezdirən, bıqdırıcı, bezikdirici, yorucu, üzücü. [Rza Ulduza:] *Hər şey cansıxıcıdır, usandırıcı, yorucudur*. M.İbrahimov. *Cırcıramaların usandırıcı səsi ətrafı bürümüşdü*. Ə.Vəliyev.

**USANDIRMA** "Usandırmaq"dan *f.is.*

**USANDIRMAQ** *f.* Təngə gətirmək, bezdirmək, bıqdırmaq; yormaq, üzmək. *Məni candan usandırdı, cəfadan yar usanmazmı?* Füzuli. *Böylə əsəbi qonşu hər halda insanı usandırar*. H.Cavid.

**USANMA** "Usanmaq"dan *f.is.*

**USANMAQ** *f.* Təngə gəlmək, bıqmaq, bezmək, canı sıxılmaq, yorulmaq, üzülmək. [Doktor Zibeydəyə:] *Həyat öz-özlüyündə mücərrəd olaraq o qədər gözəldir ki, ondan doymaq və usanmaq olmaz*. Çəmənzəminli. [Laçın] *uzun get-gəllərdən usandı.* M.Hüseyn. [Rəşid:] *Yaşı altmışdan ötmüş olsa da,* [Bəyim xalanın] *hələ bir dəfə "yoruldum, usandım", – dediyini eşitməmişdim*. İ.Hüseynov.

**USANMAZ** *sif.* Yorulmaz, yorulmaq bilməyən.

**USANMAZLIQ** *is.* Yorulmazlıq, yorulmaq bilməmə.

**USLU** *sif. qəd.* 1. Ağıllı, dərrakəli, zəkalı, fərasətli.

2. Ədəbli, tərbiyəli, ağıllı-kamallı. *Yadımdadır onun: "Gözəl balam usludur; Yoxsa nağıl söyləmərəm sənə", – deyən sədası.* M.Rahim.

**USTA** *is.* 1. Bir sənəti lazımınca, əsaslı surətdə öyrənib onunla məşğul olan adam; sənətkar. *Bununla belə onun bircə nəfər həqiqi dostu var idi: saatsaz usta Zeynal.* Ə.Haqverdiyev. *Usta Fərrux işdən kefi kök qayıtmışdı*. B.Bayramov. // Peşə, sənət öyrədən şəxs; tərbiyəçi, müəllim. [Yusif] *varid oldu Həmədana, orada usta Xəlilin yanında qırx yaşında ikən sərraclıq sənətini bir il müddətində öyrənib, Qəzvinə müraciət etdi*. M.F.Axundzadə. // Öz işində böyük bacarıq və məharət qazanmış mahir adam, mahir sənətkar. *Bədii söz ustası. İncəsənət ustalarının konserti. Üzümçülük ustası. – Usta gəmiçilər tufanda belə; Sükanı düz tutar öz əllərilə.* S.Vurğun. [Rəssam] *öz sənətinin bacarıqlı bir ustası idi.* M.Hüseyn. // *məc*. Ümumiyyətlə, mahir, bacarıqlı, zirək adam haqqında. [Aslan bəy:] *Xeyr, lazım deyil, .. Əhməd özü ustadır, əldən qoymaz*. N.Vəzirov. *Bişirdiyi xörəyin şirin yeyilməsindən bildi ki, o hər şeydə naşı olsa da, əlsuyu verməklə aş bişirməkdə ustadır.* Mir Cəlal. ☐ **Usta tərpənmək** – zirəklik göstərmək, zirək tərpənmək, biclik işlətmək. *Siyasət həmişə bir oyuncaqdır; Kim usta tərpənsə, o udacaqdır*. S.Vurğun.

2. İstehsalatda, uçuşda və s.-də inzibati və texniki rəhbərliyi həyata keçirən şəxs. *Növbə ustası. Buruq ustası.*

3. Ən görkəmli idmançılara verilən ad və bu adı daşıyan şəxs. *Əməkdar idman ustası.*

**USTABAŞI** *is. köhn*. Bir neçə ustaya rəhbərlik edən usta, baş usta. *Ustabaşı kənarda durub məlumat verir, qabarlı əllər ilmə düyürdü*. Çəmənzəminli. // Ustaya hörmətlə müraciət. [Qərib:] *Xəbər söylə mənə, ay ustabaşı; Əlindəki sazı necə çalırsan?* "Aşıq Qərib". [Xərabati:] *Mana bax... Ey, mana bax, ustabaşı! Gördüyün varmı bizim arxadaşı?* H.Cavid.

**USTACASINA** b a x **ustadanə**.

**USTAD** *is.* [*fars.*] Elm və ya sənət sahəsində geniş və dərin məlumatı və qabiliyyəti olan şəxs. *Qabil şagird ustad olur ustadan.* (Ata. sözü). // *məc*. Müəllim, tərbiyəçi, öyrədici, mürşid. *Ey yorulmaq bilməyən ustadımız! Yandı mövtünlə dili-naşadımız.* A.Səhhət.

**USTADANƏ** *zərf* və *sif.* [*fars.*] *köhn*. Ustalıqla, ustacasına, məharətlə, bacarıqla,

məharətli. *Qüdrətli fikir və sözlərin düzgün, yerində, ustadanə deyilməsi cümlənin təsir qabiliyyətini artırır*. M.İbrahimov.

**USTADLIQ** *is.* Məharət, bacarıq; bir işdə qazanılan şöhrət. *Qəribin ustadlığı ətrafa yayılmışdı.* "Aşıq Qərib".

**USTADNAMƏ** *is.* [*fars.*] Azərbaycan şifahi xalq ədəbiyyatında çox vaxt qoşma, bəzən də divani şəklində olub, məzmunca hikmətamiz, nəsihətamiz, fəlsəfi məzmunda şeir növlərindən biri (bir ənənə olaraq aşıqlar dastana ustadnamə ilə başlayırlar). *Elə ona görə mən də naşı şəhər balalarına yaxşı bir ustadnamə oxudum*. S.Rəhimov.

**USTALAŞMA** "Ustalaşmaq"dan *f.is.*

**USTALAŞMAQ** *f.* Ustalığı, təcrübəsi, məharəti, bacarığı artmaq; püxtələşmək, bişmək, təcrübələnmək. *..Həmişə də qiymətli xam at alıram ki, onu qoşquya öyrədim və bu yolda ustalaşmışam da*. C.Məmmədquluzadə. *Bilirsən ki, indi xalq ustalaşıb, burada bir az səsinə səs vermədin, basıb rayona gedir.* Mir Cəlal.

**USTALIQ** *is.* 1. Hər hansı bir sahədə çalışan ustanın işi, peşəsi.

2. Hər hansı bir sahədə böyük bacarıq, məharət. *İşdə bir incəlik, ustalıq və xüsusi qabiliyyət görünürdü*. Ə.Vəliyev. // Ümumiyyətlə, məharət, bacarıq. *Əsil ustalıq burdadır*. Qantəmir. *Bax, bu, böyük ustalıq tələb edən bir fəndir*. Ə.Əbülhəsən.

3. **Ustalıqla** şəklində *zərf* – məharətlə, bacarıqla, ustacasına, mahircəsinə. *Ustalıqla hərəkət etmək. Rolu ustalıqla ifa etmək.* – *Səlim bəy çox ustalıqla .. təbəssümünü təkrar etdi.* H.Nəzərli. *Ümumən Müqim bəy arvadından çəkindiyini daima özü də ustalıqla malalamağa çalışırdı.* S.Rəhimov.

**USTAYANA** b a x **ustacasına**. *..Müalicə müvəqqəti vasitələrdən ustayana istifadə etməyi bacarmaqdan asılıdır*. Mir Cəlal.

**UŞAQ** *is.* 1. Azyaşlı oğlan, ya qız; çocuq. *Uşaqlar üçün kitab. Uşaqların tərbiyəsi.* – *Şerə başlarkən uşaqdım, dostlar!* S.Rüstəm. *Uşaqlar çox vaxt qolsuz bir köynəklə yaşıl ot üstündə ayaqyalın gəzirlər*. Mir Cəlal. // Cavan, gənc (oğlan, ya qız). *İnad uşaq. Cəsarətli uşaq*. *Yaxşı uşaqdır. Tərbiyəli uşaqdır.*

2. Oğlan, ya qız (körpə, bala). *Südəmər uşaq. Doğulan uşaq oğlandır. Əkiz uşaqlar.* – *..Sürəyya uşaq doğarkən vəfat etdi.* S.S.Axundov. □ **Uşağı olmaq** – övladı olmaq, uşaq doğmaq (oğlan, ya qız). **Uşağı olmamaq** – sonsuz, övladı olmayan adam haqqında. *Aşıq Cünun bilirdi ki, Koroğlunun uşağı olmur*. "Koroğlu". *Əsmərin uşağı olmurdu*. S.Hüseyn.

3. *məc*. Müqayisə, bənzətmə məqamında. *Uşaq kimi hərəkət etmək. Havaxta qədər belə uşaq olacaqsan?* – [Sultan bəy:] *Uşaq ki deyilsən, hər bir şeyi bilirsən, anlayırsan.* Ü.Hacıbəyov. [Hümmət:] *Ay Qara Yusif, ay eloğlu, sən də belə? Əyə, sən də uşaq kimi danışdın?* B.Bayramov.

◊ **Uşaq bağçası** – məktəbəqədər yaşlı uşaqlar üçün tərbiyə müəssisəsi. **Uşaq evi** – ata-anaları olmayan uşaqlar üçün internatı olan təlim və tərbiyə müəssisəsi. [Seryoja:] *Deyirlər ki, 1941-ci ilin dekabrında məni uşaq evinə vermişlər.* Z.Xəlil. **Uşaq kimi baxmaq (bəsləmək)** – əzizləmək, çox sevmək, göz bəbəyi kimi qorumaq, başına-ayağına keçmək. [Qulu:] *Xədicə xanım, görünür, Yusif bəyi çox istəyir. Onu lap uşaq kimi bəsləyir.* N.Nərimanov. **Uşaq şəhərciyi** – uşaqlar üçün sağlamlaşdırma və tərbiyə müəssisəsi (bağlarda, parklarda və s.-də). **Uşaqların anası** *evf.* – arvad, zövcə. *Gördüm uşaqların anası öz-özünə mırtdanır.* C.Məmmədquluzadə. *Qurban Molla Fərzəliyə bir az da yaxınlaşdı. Gizli bir söz söyləyirmiş kimi fısıldayaraq: – Molla, əvvəlcə məndən uşaqların anasına salam yaz, – dedi.* **Uşaqların atası** *evf.* – ər, kişi.

**UŞAQCANLI** *sif.* Öz uşaqlarını, öz övladlarını həddən artıq sevən, onlara qayğı və nəvaziş göstərən; övladcanlı. *Uşaqcanlı ana.* – *Nubar xala yazdı ki, mənim kişim məzlumun birisi, uşaqcanlı girdimanlıdır*. S.Rəhimov. *Qoşatxan uşaqcanlı atalardan olduğundan Mələk onun sualındakı narahatlığı duydu.* M.İbrahimov.

**UŞAQCANLILIQ** *is.* Öz uşaqlarını, öz övladlarını həddən artıq sevmə, onlara çox qayğı və nəvaziş göstərmə; övladcanlılıq.

**UŞAQCASINA** *zərf* Uşaq kimi, qeyri-ciddi, sadədilcəsinə, sadəlövhcəsinə. *Uşaqcasına hərəkət. Uşaqcasına mühakimə.* – *Ayrım qızı Kərim babanın uşaqcasına işlərindən, qəribə*

*hərəkətlərindən acıqlanar, Kərim babanın arxasınca hər gün söylənərdi*. A.Şaiq. *Sona birdən uşaqcasına sual verib, Səttarın qoluna baxdı*. Ə.Əbülhəsən.

**UŞAQCIĞAZ** "Uşaq"dan *oxş*. *Uşaqcığaza nə oldu? Uşaqcığaz bərk qızdırıb*. – [Xanımnaz:] ..*Uşaqcığazım üçün qorxuram. Salıblar onu dilə-ağıza*. C.Cabbarlı.

**UŞAQCIQ** *kiç*. Kiçik uşaq, balaca uşaq, yazıq uşaq. [Tükəz:] [Hacı Qaranın] *başına bir iş gəlsə, uşaqcıqlarım yetim qalacaq*. M.F.Axundzadə.

**UŞAQƏMİZDİRƏN** *sif.* Öz südü ilə uşağını bəsləyən, südəmər uşağı olan. *Uşaqəmizdirən analar.*

**UŞAQLAŞMA** "Uşaqlaşmaq"dan *f.is.*

**UŞAQLAŞMAQ** *f.* Qocalıqdan ağlı zəifləşmək, xərifləmək, özünü uşaq kimi aparmaq. *Görünür, adam qocaldıqca uşaqlaşır*. S.Rəhimov.

**UŞAQLI** *sif.* Uşağı ya uşaqları olan. *Uşaqlı qadın*. – [Cəmilə:] *Əhməd uşaqlı anaya heç bir zaman kəm baxa bilməz*. S.Rəhimov.

**UŞAQLIQ** *is.* 1. Uşaq yaşları. *Uşaqlıq dövrü. Uşaqlıq illəri yadımdadır. Uşaqlığı kənddə keçib. Uşaqlıq xatirələri. – Axtarıram, uşaqlıq düşmür ələ; Halım olur fəna bu gündən belə*. A.Səhhət. *Fərmanın uşaqlığı İsmayıllı rayonunun Zoğallıq kəndində keçmişdir*. Ə.Sadıq.

2. *məc*. Uşaq hərəkəti, uşaqcasına hərəkət; qeyri-ciddilik; ağılsızlıq. ☐ **Uşaqlıq eləmək (etmək)** – düşünmədən hərəkət eləmək (etmək), ağılsızcasına hərəkət eləmək (etmək), ağılsızlıq eləmək (etmək).

3. Ana bətni.

**UŞAQLIQDAN** *zərf* Uşaqlıq illərindən, uşaq olduğu vaxtdan, lap kiçik yaşlarından. *Məndə uşaqlıqdan folklora maraq oyadan Yusif əmi olmuşdur*. A.Şaiq. *Müşgünaz uşaqlıqdan təkliyi sevmir, yalqızlıqdan darıxırdı*. Ə.Vəliyev.

**UŞAQSALDIRMA, UŞAQSALMA** *is. tib*. Hamiləliyin süni yolla vaxtından qabaq dayandırılması və dölün ana bətnindən çıxarılması.

**UŞAQSEVƏN** *sif.* Uşaqları sevən, balaca uşaqlara nəvaziş göstərən, onları əyləndirməyi sevən (adam).

**UŞAQSEVƏNLİK** *is*. Uşaqlara məhəbbət, uşaqları sevmə.

**UŞAQSIZ** *sif.* Uşağı, övladı olmayan, övladsız. *Uşaqsız qadın.*

**UŞAQSIZLIQ** *is*. Uşağı, övladı olmama; övladsızlıq; sonsuzluq.

**UŞQUN** *is. köhn*. [*rus.,* əsli *ing*. Schoonerdən] İkidorlu yelkənli gəmi (qayıq). [Yengə:] *Hacı ağa, gəlinin sənə salam verir, ona nə bağışlayırsan? Qayınata da ona ya on imperial, ya bir bağ, ya bir ev, ya da bir uşqun bağışlardı*. H.Sarabski.

**UŞQUNÇU** *is. köhn*. Uşqun sahibi, uşqunda işləyən, gəmiçi.

**UTANCAQ** *sif.* və *is*. Çox utanan, alışmadığı mühitdə, şəraitdə adamların yanında sıxılan, üzü qızaran. *Utancaq uşaq. O çox utancaqdır*. – [Uğur:] *Əmiqızı, mən gedəndə sən bir utancaq qız idin*. İ.Əfəndiyev. // Zərf mənasında. *Telli utancaq bir halda üzünü müəllimə tutub dedi: – Bağışlayın, sizə zəhmət verdim!* S.Hüseyn. [Əjdər] *sözünə davam edə bilmədi, utancaq bir halda susdu*. S.Rəhman.

**UTANCAQLI** b a x **utanılacaq**. *Əslində iş öz-özlüyündə bir az* [Nadirin] *nəzərində utancaqlı idi*. B.Talıblı.

**UTANCAQ(LI)LIQ** *is*. Utancaq adamın hal və xasiyyəti, hər şeydə utanma xasiyyəti. *Utancaqlıq yaxşı şeydir, amma öz yerində!* Mir Cəlal. // İsmət, həyalılıq, abırlılıq. *Onun ən gözəl və sevimli xüsusiyyətlərindən birisi zahiri görünüşündə olan məhcubluğu, həyalılığı və utancaqlılığı idi*. M.S.Ordubadi. *Gəlinin utancaqlığı, hətta gəlib başının üzərində dayanan adamın üzünə baxmaqdan həya eləməsi Səmədə daha xoş gəldi*. İ.Hüseynov.

**UTANDIRMA** "Utandırmaq"dan *f.is.*

**UTANDIRMAQ** *f.* Birinin utanmasına, xəcalət çəkməsinə səbəb olmaq, bir söz deyərək, ya danlayaraq, töhmətləndirərək onda xəcalət və ya peşmançılıq hissi oyatmaq, qızartmaq, utancaq bir vəziyyətə salmaq. *Uşağı utandırmaq*. – [Həsənqulunu] *lazımınca utandırıb töhmətləndirdilər və qərarın da* [surətini] *əlinə verdilər*. Çəmənzəminli. *Oğul fikirləşir, anasının dedikləri onu utandırır, bədəninə lərzə salırdı*. Ə.Vəliyev.

**UTANIB-QIZARMA** "Utanıb-qızarmaq"-dan *f.is. Mən Laçının utanıb-qızarmasına razı olmadım və dedim*. H.Nəzərli.

**UTANIB-QIZARMAQ** b a x **utanmaq**. [Məmməd] *qalxdı, utanıb-qızararaq səs gələn tərəfə getdi*. Çəmənzəminli. *Doktor çeşməyini götürüb cibinə qoyur, açıq gözilə Gülöyşəyə baxır, Gülöyşə isə utanıb-qızarmırdı*. S.Rəhimov.

**UTANILACAQ** *sif.* Xəcalətə, utanmağa səbəb olan, münasib olmayan, pis. *Burada utanılacaq şey yoxdur*.

**UTANMA** "Utanmaq"dan *f.is.*

**UTANMAQ** *f.* 1. Bir işdən, hərəkət və sözdən, ya da başqa bir səbəbdən xəcalət çəkmək, mənəvi üzüntü duymaq. *Bolqar öz dilini bilmədiyindən xəcalət çəkəndə bizlər də öz dilimizdə danışmaqdan utanırıq*. C.Məmmədquluzadə. *Qərənfil utanıb başını aşağı saldı*. S.Rəhman.

2. Utandığından, xəcalətindən bir şeyə cəsarət etməmək. *Ondan xahiş etməyə utanıram. – Nə üçünsə kişilərin palatasına girib, onu soruşmağa və hətta Səidə xanıma bu barədə sual verməyə də utanırdım*. M.Hüseyn. *Gəlməyə utanan* (f.sif.) *qız indi cəsarətlə qapını döydü*. S.Vəliyev. // Çəkinmək (bu mənada bəzən "utanıb-çəkinmək" şəklində işlənir). *Nə var qızım, nə oldu sana? Utanma, dərdini aç, söylə mana*. S.Vurğun. *Ümid yazdığı məktubun cavabını soruşmaqdan utanıb-çəkinirdi.* B.Bayramov.

**UTANMAQSIZIN, UTANMADAN** *zərf* Utanmayaraq, xəcalət çəkmədən, həyasızcasına, təklifsizcəsinə, arsız-arsız. *Utanmaqsızın* (*utanmadan*) *böhtan atmaq*.

**UTANMAZ** *sif.* və *is.* Heç şeydən utanmayan, həya etməyən, həyasız, arsız, abırsız. *Utanmaz hərəkət. Utanmaz adam. Utanmazın biridir. – Qorx qorxmazdan, utan utanmazdan.* (Ata. sözü).

**Utanmaz-utanmaz** b a x **utanmazcasına**. *Utanmaz-utanmaz irişmək. Utanmaz-utanmaz böhtan atmaq*. – [Minirə:] *Odur ey, bilmirəm, utanmaz-utanmaz niyə durub bura gəlib.* M.Süleymanov.

**UTANMAZCASINA** *zərf* Həyasızcasına, abırsızcasına, sırtıqcasına, həyasız-həyasız. *Utanmazcasına yalan danışmaq. Utanmazcasına cavab qaytarmaq.*

**UTANMAZLIQ** *is.* Həyasızlıq, abırsızlıq, arsızlıq; utanmaz hərəkət (söz).

**UTİ́L** [*lat.* utilis] İşlətmək üçün yaramayan, lakin xammal kimi istifadə oluna bilən şeylər, faydalı tullantılar (metal qırıntıları, əsgi-üsgü, kağız və s.). [Yunis Səlimova:] *Nədir o bir yığın doğrantı töksübsünüz, həyatinizdən keçmək olmur. Aldığınız vərəqlərin yarısını utilə qaytarırsınız?* Mir Cəlal. [Mehdizadə:] *İş-güclərini atıb util yığmaqla məşğuldurlar*. Y.Əzimzadə.

**UTİ(LƏR)** *is. tar.* Alban tayfalarından biri; müasir udinlərin sələfləri.

**UTİLİTÁR** *sif.* [*lat.* utilitas-dan] Ancaq praktik istifadəni, xeyir, fayda götürmək məqsədini güdən; praktik, tətbiqi.

**UTİLİTARİ́ZM** [*lat.*] 1. Etikada: eqoizmə, fərdiyyətçiliyə əsaslanan burjua cərəyanı (bu cərəyan tərəfdarları iddia edirlər ki, insanın bütün əməlləri ancaq hər şeydən fayda, xeyir götürmək prinsipinə əsaslanır).

2. Hər şeyə xeyir, fayda götürmək baxımından yanaşma; utilitarlıq.

**UTİLİTARLIQ** b a x **utilitarizm** 2-ci mənada.

**UTİLİZÁSİYA** [*lat.* utilis-dən] İstifadə etmə (edilmə), səmərəli istifadə. // Tullantıların, yarımfabrikatların, yanacaq materiallarının və s.-nin xammal kimi istifadə edilməsi.

**UTİLYIĞAN** *is.* Util yığmaqla məşğul olan işçi.

**UTOPİ́K** *sif.* [*yun.*] 1. *fəls*. Utopiya (1-ci mənada) üzərində qurulmuş; qeyri-elmi, xəyali. *Utopik sosializm*.

2. Həyata keçə bilməyən, qeyri-real, xam xəyaldan başqa bir şey olmayan; xəyali. *Lakin Elxanın zəif cəhətləri də vardır. Onun gələcək cəmiyyət haqqındakı fikirləri xəyali və utopikdir*. M.Arif.

**UTOPİ́ST** [yun.] Utopizmə qapılmış adam: xəyalpərəst.

**UTÓPİYA** [*yun.* utopos] 1. Cəmiyyəti yenidən qurmaq, ideal cəmiyyət yaratmaq haqqında qeyri-elmi fəlsəfi görüş, nəzəriyyə.

2. Həyata keçirilə bilməyən fantaziya, xam xəyal.

**UVERTŰRA** [*fr.* ouvertura] Operanın, baletin və s.-nin müqəddiməsi. "*Koroğlu*" *operasının uvertürası. – Ümumiyyətlə, opera əsərləri simfonik orkestr tərəfindən hələ pərdə*

*açılmazdan əvvəl ifa edilən uvertüra, ya da introduksiya* (*müqəddimə*) *ilə başlanır*. Ə.Bədəlbəyli.

**UVOLOGİYA** *is*. [*lat*.] Üzümün salxım və giləsinin struktur komponentləri haqqında elm.

**UYAR(LI)** *sif*. Uyğun, müvafiq, münasib, düzgələn, uyan, uyğun gələn.

**UYARLIQ** *is*. Uyma, uyğun gəlmə, düz gəlmə; uyğunluq, münasiblik.

**UYARSIZ** *sif*. Uymayan, uyğun gəlməyən, düz gəlməyən, müvafiq olmayan, uyğunsuz.

**UYARSIZLIQ** *is*. Uyğunsuzluq, uymama, düz gəlməmə, uyğun olmama.

**UYDURMA** 1. "Uydurmaq"dan *f.is*.

2. *is*. Həqiqətdə mövcud olmayıb birisi tərəfindən uydurulan əsilsiz şey; qondarma, yalan, əfsanə, saxta. [Qoca Baxşı:] *Çünki oradakı həyat ona yabançı və xəyali bir uydurma kimi görünəcəkdir*. C.Cabbarlı. *Oxucu elə güman edər ki, bəlkə belə bir kənd olmayıb, uydurmadır və ya nədir*. S.Rəhimov.

**UYDURMAÇI** *is*. Olmamış, ya olmayan bir şeyi özündən uyduran, özündən quraşdıran adam; yalançı, qondarmaçı, iftiraçı, böhtançı. *Uydurmaçının biridir. Mən belə uydurmaçıya rast gəlməmişəm*.

**UYDURMAÇILIQ** *is*. Olmamış, ya olmayan bir şeyi özündən uydurma, özündən düzəltmə, qondarma; qondarmaçılıq, yalançılıq, saxtaçılıq.

**UYDURMAQ** *f*. 1. Olmamış, ya olmayan bir şeyi öz xəyalında yaratmaq, özündən düzəltmək, özündən quraşdırmaq; qondarmaq. [Kazım] *hər halda bir bəhanə uydurmağı qərara aldı*. M.İbrahimov. // *məc*. Yuxulatmaq, gözünü bağlamaq, iğfal etmək. [Gülüş Sevilə:] *Balaş səni anlamır, o səni həyatdan gizlədir, uydurur, o səni öz istədiyi kimi yağışdan çıxarıb yağmura salacaqdır*. C.Cabbarlı.

2. Uyğunlaşdırmaq, uyuşdurmaq, uyğun hala gətirmək, uyğun etmək. *Qoysanız öz oğlumu mən salım öz halimə; Sənətimi öyrədib uydurum öz halimə?!* M.Ə.Sabir. *Oxşadır səsini bir komandana; Ayaqlar özünü uydurur ona*. S.Vurğun.

**UYDURUCU** b a x **uydurmaçı**.

**UYDURULMA** "Uydurulmaq"dan *f.is*.

**UYDURULMAQ** *məch*. 1. Özündən düzəldilmək, özündən quraşdırılmaq, özündən qondarılmaq. *Siz bəlkə bunu uydurulmuş* (f.sif.), *xəyali bir əfsanə zənn edərsiniz*. S.Hüseyn. *Bəlkə Tahirin ali təhsil almadığına dair deyilən sözlər nə məqsədlə isə uydurulmuş* (f.sif.) *sadəcə bir bəhanə idi?* M.Hüseyn.

2. Uyğunlaşdırılmaq, uyuşdurulmaq, uydurulmaq, uyğun şəklə salınmaq. *Əcdadın mənəviyyatına uydurulmuş* (f.sif.) *bir ölçü bizə də tövsiyə olunur*. Çəmənzəminli.

**UYÉZD** [*rus*.] b a x **qəza**[2]. [İsmayıl bəy:] *Necə də qudurğan olmasınlar ki, tamam uyezd onların əlindədir*. N.Vəzirov. *Nəinki Naməlsəm məhəlləsində, bəlkə bütün kənddə, uyezddə dəxi bundan dövlətli, zəngin adam tapılmazdı*. N.Nərimanov.

**UYĞUN** *sif*. 1. Uyar, müvafiq; düz gələn, müvafiq olan, lazımi şəkildə olan, bir şey üçün yararlı olan. *Qətibə bu əlaqənin başlanmasını öz məqsədinə uyğun bilirdi*. M.S.Ordubadi. *Dükandan çoxdan bəri arzusunda bulunduğum bir kiçik və uyğun dəstək alıb parasını verdim*. T.Ş.Simurq. [Oğlan] *güləgülə və oranın yerli şivəsinə uyğun, xalis və təmiz bir Azərbaycan dilində mənə cavab verdi*. M.Rzaquluzadə. // Münasib, layiq, yaraşan; tələbə, şərtə cavab verən. *Uyğun bir vəzifə. Qabiliyyətinə uyğun bir iş*. – [Jasmen:] *Saray artisti demək pək uyğun*. H.Cavid. // Bir-birinə uyan, həmahəng olan. *Uyğun səslər uçuşur sol, sağında; Şən bülbüllər, dadlı dillər bizimdir*. A.Şaiq. ☐ **Uyğun gəlmək** – düz gəlmək, uymaq, uyğun olmaq, müvafiq olmaq. [Badsəba:] *Zatən təbiətimiz* [Muradla] *bir-birinə uyğun gəldi*. Çəmənzəminli. *İskəndər, yaşına uyğun gəlməyən bir çeviklikIə ayağa qalxıb eşiyə çıxdı*. M.Hüseyn.

2. Əlverişli, münasib. *Mallar uyğun bir qiymətə satılır*.

**UYĞUNLAŞDIRILMA** "Uyğunlaşdırılmaq"dan *f.is*.

**UYĞUNLAŞDIRILMAQ** "Uyğunlaşdırmaq"dan *məch*.

**UYĞUNLAŞDIRMA** "Uyğunlaşdırmaq"-dan *f.is*.

**UYĞUNLAŞDIRMAQ** *f*. Uyuşdurmaq, uyğun hala gətirmək, müvafiqləşdirmək, yaraşdırmaq. *Sinir sistemi bədən üzvlərinin işini tənzim edir, uyğunlaşdırır və əlaqələndirir*. – *Səfdərəli bildiyi saysız-hesabsız məzhəkələrin ən yaxşılarından üçünü seçib musiqiyə uyğunlaşdırmışdı*. İ.Əfəndiyev.

**UYĞUNLAŞMA** "Uyğunlaşmaq"dan *f.is.*

**UYĞUNLAŞMAQ** *f.* Uyğun hala gəlmək; bir şeyə uyuşmaq, vərdiş etmək, öyrəşmək. *Yeni mühitə uyğunlaşmaq. Dağ iqliminə uyğunlaşmaq. Yeni həyat şəraitinə uyğunlaşmaq.* – [Surxay:] *Qazmaçılar şəraitə uyğunlaşmayıblar*. M.Süleymanov. // İç üzünü gizlədərək yeni şəraitdə hərəkət etməyi bacarmaq.

**UYĞUNLUQ** *is.* Uyğun olma, uyğun gəlmə; müvafiqlik, münasiblik, bir-birilə düz gəlmə; həmahənglik. *Fikirlər arasında uyğunluq.* – *Camenin quruluşu, cizgilərin incəliyi, boyaların uyğunluğu Midhət əfəndini məşğul etməyə başladı.* Çəmənzəminli.

**UYĞUNSUZ** *sif.* 1. Uyğun olmayan, uymayan, düz gəlməyən, müvafiq gəlməyən. *Uyğunsuz yer. Uyğunsuz vəziyyət.*

2. Münasib olmayan, layiq olmayan, yaraşmayan, namünasib, uyuşmaz. *Uyğunsuz hərəkət. Uyğunsuz söz.*

**UYĞUNSUZLUQ** *is.* Aralarında uyğunluq olmama, bir-birilə düz gəlməmə (tutmama). *Xasiyyətlərdə uyğunsuzluq.* – *Ana isə dar şalvarı bəyənmir, çəkmə ilə onun tənasübündə nə isə bir uyğunsuzluq görürdü*. M.Hüseyn. *Qüruru və şax gəzişi ilə paltosunu çiynində əyri tutması .. gülməli bir uyğunsuzluq təşkil etdiyini Həmzə özü bilmir, bir ara heç kəsə baxmırdı.* Ə.Əbülhəsən. // Uyuşmazlıq, ahəngsizlik. *Atası ilə anası arasında olan küskünlük, ailə həyatında olan uyğunsuzluq onda acı təsirlər oyadırdı.* A.Şaiq. // Uzlaşmazlıq, uzlaşmama.

**UYĞUR(LAR)** Orta Asiyada və Qərbi Çinin bəzi rayonlarında yaşayan türkdilli xalq. *Uyğur dili. Uyğur ədəbiyyatı*.

**UYĞURCA** *sif.* və *zərf* Uyğur dilində. *Uyğurca-rusca lüğət. Uyğurca danışmaq.*

**UYQU** *is.* Yuxu. *Kəndlilər çox yorulub, uyqudan indi oyanır*. A.Səhhət. *Müəllim oyaqlıqla uyqu arasında idi.* S.Hüseyn.

**UYQULU** *sif.* Yuxulu. *Dideyi-bəxtim oyanmaz, nə ağır uyquludur*. Füzuli.

**UYQUSUZ** *is.* Yuxusuz. [İsmət:] *Keçən gecə bir xeyli fikrə daldım; Düşündüm, düşündüm, uyqusuz* (z.) *qaldım*. H.Cavid. *Bəziniz uyqulu, bəziniz uyqusuz; Sizdə var qoxusu hər yerin, küləklər!* M.Müşfiq.

**UYQUSUZLUQ** *is.* Yuxusuzluq.

**UYMA** "Uymaq"dan *f.is.*

**UYMAQ** *f.* 1. B a x **qapılmaq**[2]. *Qərinələrlə məst olub cəhalətə uyduq! Hansı günümüzü xoş keçirdik?* C.Məmmədquluzadə. *Meydanda durun mərd kimi; Uymayın ötəri şöhrətə, ada.* B.Vahabzadə. // İnanaraq tabe olmaq, razı olmaq, güzəştə getmək; dilə aldanmaq; təsir altına düşmək. *Yalana uymaq. – Əzizim, içmə, dostum! Hər sudan içmə, dostum! Uyma əğyar sözünə! Dostundan keçmə, dostum!* (Bayatı). [Ziba xanım:] *Sənin gözün örtülüb, uyubsan bu çənginin məkrinə, felinə, təmiz adını itiribsən.* M.F.Axundzadə.

2. Bənd olmaq, vurulmaq, sevmək. *Uyubsan zalım xoryada; Dostdan kənar gəzən gözəl!* Aşıq Ələsgər. [Tutubəyim Ağabəyimə:] [Atan] *bir müddət Hacı Kərimin qızına uydu, indi də Gəncədən təzə gətirdiyi bacıma uyub*. Çəmənzəminli.

3. Uyğun gəlmək, uyğun olmaq, münasib olmaq, düz gəlmək, yaraşmaq. *Vay, vay! Deyəsən, bəşər deyil bu! Bir şəklə uyan təhər deyil bu!* M.Ə.Sabir. *Bu iki adamın təbiəti bir-birinə əsla uymayırdı*. A.Şaiq.

**UYUMA** "Uyumaq"dan *f.is.*

**UYUMAQ** *f.* 1. Yuxulamaq. *Nəhayət, uyuyan* (f.sif.) *uşaq tərpənib gözlərini açdı.* T.Ş.Simurq. // Məc. mənada. *Rahat uyu, qəhrəman əsgər! – Uyuyur məncə məzarında sənin; Ağlayan qanlı bir əsrin dərdi*. S.Rüstəm.

2. *məc*. Həyat əsəri göstərməmək, tam sükut içində olmaq, sükuta dalmaq, fəaliyyətsiz, hərəkətsiz halda olmaq. *Qapı təkrar döyüldü, səs sükut içində uyuyan* (f.sif.) *dalana düşüb, əks-sədalar doğurdu*. Çəmənzəminli. *Yer uyuyur, göy dincəlir; Ətrafa duman çökür.* H.Hüseynzadə.

**UYUMUŞ** *sif.* Yuxulamış, yatmış. *Uyumuş uşaq*. // Məc. mənada. [Rüstəm bəyin] *çoxdan bəri uyumuş milli hissi qələyana gəldi.* Çəmənzəminli. *Duyduğu ətir iyi damarlarında uyumuş sevgi hisslərini oyandırırdı*. M.S.Ordubadi. // *məc*. Qəflətdə olmaq, yuxuda olmaq, dünyadan xəbərsiz olmaq.

**UYUŞDURMA** "Uyuşdurmaq"dan *f.is.*

**UYUŞDURMAQ** *f.* Bir-birinə uydurmaq, uyğunlaşdırmaq, uyğun etmək, yaraşdırmaq.

**UYUŞMA** "Uyuşmaq"dan *f.is.*

**UYUŞMAQ** *f.* 1. Keyləşmək, keyimək, hissizləşmək, duyma qabiliyyətini itirmək.

*Soyuqdan əlləri uyuşdu. – Göyərçin uyuşan* (f.sif.) *əllərini bərk sıxaraq: – Baxaq... görək, – dedi.* S.Rəhimov. *Alnını soyuq tər basdı. Bədəni uyuşub açıldı.* Ə.Vəliyev.

2. Uyğunlaşmaq, uyğun gəlmək; alışmaq. // Müvafiq olmaq, uymaq, tutmaq, uyğun gəlmək. *Sanki* [Firidun] *bir-birilə heç bir zaman uyuşa bilməyəcək ziddiyyətlərin əbədi ahəngini yaratmışdı.* M.İbrahimov. *Lakin bu kostyum* [Mehdizadənin] *ayaqlarındakı yumşaq məslərlə heç də uyuşmurdu.* Y.Əzimzadə. // Yetişmək, qovuşmaq, ulaşmaq. [Solmaz:] *İndi mən yalnız göyləri, işıqları, ulu Hörmüzün ülviyyətini və ona uyuşmağı düşünürəm.* C.Cabbarlı.

**UYUŞMAZ** *sif.* Bir-biri ilə uyuşmayan, düz gəlməyən, uyğun olmayan, bir-birinə uymayan, bir-birinə zidd olan; bir yerdə ola bilməyən; barışmaz. *Uyuşmaz ziddiyyətlər. Uyuşmaz xasiyyətlər.*

**UYUŞMAZLIQ** *is.* Uyuşmama, bir-birinə uyğun gəlməmə, uymama, bir-birinə zidd olma; barışmazlıq.

**UYUŞUQ** *sif.* Keyikmiş, keyləşmiş, duyma qabiliyyətini itirmiş; uyuşmuş.

**UYUŞUQLUQ** *is.* Uyuşmuş şeyin halı; uyuşma, keyikmə, keyimə. [Cuma] *qıçlarında və qollarında bir uyuşuqluq, boynunda, həm də çiyinlərində ağrı, köksündə nə isə bir tənglik hiss edirdi.* Ə.Əbülhəsən.

**UYUTMA** "Uyutmaq"dan *f.is.*

**UYUTMAQ** *f.* Yatırtmaq, yuxulatmaq. *Sizin ürəyinizdə böyük sirlər yatdığı kimi, bu kiçik sirri də orada uyuda bilərsiniz!* M.S.Ordubadi. *Minarədən bütün varlığı uyudacaq bir layla kimi azançının həzin, bihuşedici səsi eşidilirdi.* M.İbrahimov.

**UY-UY** *təql.* Ağrı, qorxu, ürkmə və s. hissləri ifadə edir. [Şeyx Nəsrullah] .. *birdən* "*uy-uy*" *eləyib, sol əlini qoyur böyrünə.* C.Məmmədquluzadə.

**UZADILMA** "Uzadılmaq"dan *f.is.*

**UZADILMAQ** "Uzatmaq"dan *məch. İp uzadıldı. Yol bir kilometr uzadıldı. Yerə uzadılmaq. Məsələ çox uzadıldı.*

**UZAĞI** b a x **uzaqbaşı**. [Zeynal:] *..Allahqulu gör nə deyir? Deyir, uzağı sabah Veys anasını Sona üçün elçi göndərər.* Ə.Əbülhəsən.

**UZAQ** *sif.* və *zərf* 1. Məsafə etibarilə yaxın olmayan, çox aralı olan (*yaxın* ziddi). *Uzaq yerlər. Uzaq məsafə. – Köhnə Azərbaycanın uzaq bir bucağında; Qoca Həsən dayının alçaq koması vardı.* R.Rza. *Ehtiyat xala dəmir yolundan xeyli uzaq səfalı yaylaq şəhərində yaşayırdı.* Mir Cəlal. // Çox uzun. *Mən necə oturum evdə, siz deyin; Axı uzaq yollar çağırır məni.* N.Xəzri. // Uzaqdan görünən, uzaqda olan. *Eldar dərindən köksünü ötürdü və sazı sinəsinə basıb, gözlərini uzaq bir nöqtəyə zilləyib çaldı.* M.Rzaquluzadə. *Uzaq üfüqdə dağlar qaralır, göydə tez-tez ulduz uçurdu.* İ.Əfəndiyev. // Uzaqdan gələn, uzaqdan eşidilən. *Uzaq top səsi. Uzaq uğultu səsi. Uzaq urra səsləri. – Səslənib evdə uğursuz bir zəng; Sardı ətrafı uzaq bir ahəng.* M.Müşfiq.

2. Zaman, vaxt etibarilə yaxın olmayan, indiki vaxtdan çox-çox əvvəl olan, vaxtilə, çox keçmiş zamanda olmuş, keçmişə aid olan. *Vaxtilə uzaq və amansız bir zəlzələ böyük və gözəl bir şəhəri yerlə yeksan edərkən anası da onu uçulan divarlar arasında doğmuşdu.* Ə.Məmmədxanlı. // Uzaq gələcəkdə baş verəcək, olacaq, həyata keçəcək. *Uzaq perspektivlər. Uzaq arzular. Uzaq xəyallar. Uzaq tədbirlər. Uzaq ümidlər. Uzaq planlar.*

3. *məc.* Bir şey haqqında düşünməməyi, bir şey etmək niyyətində, qəsdində, ya arzusunda olmamağı bildirir. *Bütün sevənlər kimi* [Həsən də] *Dilarada bir nöqsan tapmaqdan uzaq idi.* M.İbrahimov. *Qız savadsızlığına, hadisənin əslini əsaslı surətdə başa düşməkdən çox uzaq olduğuna baxmayaraq, vəziyyətin fövqəladəliyini dərk edirdi.* Ə.Əbülhəsən.

4. *məc.* Yad, yabançı, özgə; yaxın olmayan. *Uzaqdır sevimli gözlərin mənə.* M.Müşfiq. *Yenə gün calanır; Ötən günlərə; Mən sənə yaxınam; Sən mənə uzaq.* N.Xəzri.

5. **Uzaqda** şəklində *zərf* – uzaq yerdə, uzaqlarda, uzaq məsafədə. *Bir də nə gördüm?! Uzaqda iki göz məşəl kimi yanırdı. Baxdım, pələngdi.* A.Şaiq. *Sonra Kəpəz qızardı uzaqda yavaş-yavaş; Yandı bir yaqut kimi hər qaya, hər çaqıl daş.* Z.Xəlil.

6. **Uzaqdan** şəklində *zərf* – 1) uzaq məsafədən, uzaq yerdən, uzaqlardan. *Uzaqdan təkbir güllə səsi gəlir.* C.Məmmədquluzadə. *Uzaqdan göründü bir bölük atlı; Atları quş-*

*lardan iti qanadlı*. S.Vurğun; 2) yandan, kənardan. *Tülkü... yavuğa düşməyib uzaqdan keçdi*. Q.Zakir.

7. Cəm şəklində: **uzaqlar** – 1) uzaq yerlər, uzaq məsafələr. *Eyvana açılan qapıdan gur işıqlar qaranlığı parçalayıb uzaqlara yayıldı.* M.İbrahimov. *Cavad durbini gözünə qoyub uzaqlara baxdı.* Ə.Vəliyev; 2) uzaq məmləkətlər, uzaq ölkələr, uzaq yerlər. *İndi Bakı neft sənayesi şöhrəti uzaqlara yayılmış güclü mütəxəssislərə malikdir.* İ.Əfəndiyev.

◊ **Uzağa buraxmaq** – təxirə salmaq, daha sonraya qoymaq, daha gec bir vaxta buraxmaq, keçirmək. *Doğrudan da Əhməd məsələni uzağa buraxmayıb, o saat Nabat xanımın yanına elçi göndərdi.* B.Talıblı. **Uzağa getmək** – həyatda müvəffəq olmaq, irəli getmək, irəliləmək, artmaq, böyümək, tərəqqi etmək. ...**uzağa getmək lazım deyil** – əldə olan, hazırda olan, göz qabağında olan bir şey haqqında danışarkən deyilir. *Nümunə üçün uzağa getmək lazım deyil*. **Uzağı görmək** – gələcəyi, gələcəkdə ola biləcək şeyləri, hadisələri qabaqcadan bilmək, düşünmək. **Uzaq (uzağa) getmək** *məc*. – həddi aşmaq, danışığında, hərəkətində ifrata varmaq. **Uzaq durmaq (gəzmək)** – yaxınlaşmamaq, yaxınlıq etməmək, yaxın durmamaq, əlaqə saxlamamaq. [Balaş:] *Gülüşcan, .. bir ildir səni görməmişəm. Nə üçün məndən uzaq gəzirsən?* C.Cabbarlı. **Uzaq düşmək** – bir-birindən çox aralı düşmək, uzaqda qalmaq, uzaqda olmaq. [Qərib:] *Uzaq düşdüm mən yarımdan; İzin ver, paşa, mən gedim*. "Aşıq Qərib". [Yaralı zabit Xavərə:] *Çünki yalnız mənimlə uğraşaraq; Aqibət düşdün Arifindən uzaq.* H.Cavid. **Uzaq keçmiş** – qədim və yaxud bundan çox-çox əvvəlki dövr, zaman. *Uzaq keçmişin qalıqları. Uzaq keçmişin xatirələri. Uzaq keçmişə aid mədəniyyət abidələri. Uzaq keçmişimizin tarixinə aid materiallar*. **Uzaq qaçmaq** – yaxınlaşmamaq, yaxınlıq göstərməmək, özünü uzaq tutmaq, uzaq gəzmək, özünü yad kimi aparmaq. [Mozalanbəy:] *Eybi yoxdur, Hacıdan uzaq qaçarıq, ancaq bir hamama girək*. Ə.Haqverdiyev. *Məmməd Həsənoviç nə qədər xatalı işlərdən uzaq qaçdı, o qədər xata ondan əl çəkmədi.* M.İbrahimov. **Uzaq qohum** – kökü bir əcdada gedib çıxan, lakin sonradan getdikcə nəslən uzaqlaşan qohum. *Əzizim, bu yaxşıdır; İçməyə su yaxşıdır; Karsız, uzaq qohumdan; Yaxın qonşu yaxşıdır*. (Bayatı). [Yaşlı kişi:] *Ehtimal, uzaq qohumlarımızdan biridir ki, anamı da tanıyır.* S.Hüseyn. **Uzaq olmaq** – 1) uzaqlaşmaq, yaxın durmamaq. *Pis işlərdən uzaq olmaq. – Məskənim Qazax oldu; Ürəyim duzax oldu; Mən yara yaxın getdim; Yar məndən uzaq oldu.* (Bayatı); 2) əmr şəklində: **uzaq ol(un)** – rədd ol(un), uzaqlaş(ın), yaxın durma(yın). *Zeynal üçüncü kərə ona faytona oturmağı təklif etdikdə Mehriban əsəbiləşdi: – Məndən uzaq olunuz, – deyib onu rədd etdi*. S.Hüseyn. **Uzaq olsun** – arzu edilməyən, istənilməyən, zərərli, xətərli bir şey, hadisə haqqında. *Bəlalar başından uzaq olsun! Xəstəlik canımızdan uzaq olsun!* **Uzaq salmaq** – uzaqlaşdırmaq. *Bu hərəkatda iştirak etməmək .. bizi hər bir cəhətcə mədəniyyətdən uzaq sala bilər*. Ü.Hacıbəyov. *Ömrün hər ilinə; Bir ümman dedim; Niyə uzaq saldı bu illər bizi?!* N.Xəzri. **Uzaqdan baxmaq** – seyrçi kimi tamaşa etmək, seyrçi qalmaq, qarışmamaq.

**UZAQBAŞI** *zərf* Zaman etibarilə ən uzağı, ən geci. *Uzaqbaşı sabah gələcəyəm. Uzaqbaşı bir həftə çəkər. – Adətən* [Xanlar] *saat beşdə, ya uzaqbaşı saat altıda evlərinə dönərdi*. S.Rəhimov.

**UZAQDAN-UZAĞA** *zərf* 1. Uzaq məsafədən, uzaqdan, yaxında olmadığı halda. *Uzaqdan-uzağa tamaşa etmək. – Tapdıq uzaqdan-uzağa dənizə baxmışdı.* Ə.Əbülhəsən.

2. *məc*. Uzaqdan, bilavasitə təmasda olmadan, kənardan; bilmədiyi, tanımadığı halda. *Uzaqdan-uzağa hökm vermək olmaz. Uzaqdan-uzağa fikir söyləmək çətindir. – Tikinti kontorunun müdiri Ağarza Rəşid ilə uzaqdan-uzağa tanış idi.* Mir Cəlal. *Həyatda isə* [Odunçuoğlu] *uzaqdan-uzağa sevdiyi qıza bəzən aylarla rast gələ bilmir, onu gün işığında gördüyünü xatırlamırdı.* Ə.Məmmədxanlı. [Camal:] *Uzaqdan-uzağa adam haqqında bu qədər şey bilmək olar?* M.Süleymanov.

**UZAQGÖRƏN** *sif.* Bir şeyin aqibətini, gələcək nəticəsini qabaqcadan görməyi bacaran, bəsirətli. *Yox, yox, orda uzaqgörən oyaqlar da var; Haqq, ədalət, sülh söyləyən*

*dodaqlar da var.* S.Rüstəm. [Komandir] *uzaqgörən idi. Hər bir məsələni yüz ölçər, bir biçərdi.* Ə.Vəliyev. // Ehtiyatkar, tədbirli. *Uzaqgörən adamlar get-gedə dəyərini qaib edən kağız pullarını qızıla və brilyanta verirdilər.* Çəmənzəminli.

**UZAQGÖRƏNLİK** *is.* Bir şeyin aqibətini, gələcək nəticəsini qabaqcadan görmək qabiliyyəti; bəsirət. *Kərəmzadə siyasi uzaqgörənliyini isbata çalışdı.* B.Bayramov. *Şiraslan müsibətli adam kimi, uzaqgörənliyini yada saldı.* M.Süleymanov. // Ehtiyatkarlıq, tədbirlilik.

**UZAQGÖRÜCÜ** b a x **uzaqgörən**. *Mən elə bilirəm ki, iki hökmdarı öldürməyi bacaran bir zat uzaqgörücü siyasi düşüncəli bir zat olmalıdır.* M.S.Ordubadi. *Onların arasında məsələni dərindən və çox düzgün başa düşən uzaqgörücü adamlar olmuşdur.* M.İbrahimov.

**UZAQGÖRÜCÜLÜK** b a x **uzaqgörənlik**.

**UZAQLAŞDIRILMA** "Uzaqlaşdırılmaq"-dan *f.is.*

**UZAQLAŞDIRILMAQ** "Uzaqlaşdırmaq"-dan *məch*. *Müstəntiq də daxil olduğu halda, kənardan gələn adamlar xəstənin yanından uzaqlaşdırıldılar.* S.Hüseyn.

**UZAQLAŞDIRMA** "Uzaqlaşdırmaq"dan *f.is.*

**UZAQLAŞDIRMAQ** *f.* 1. Bir qədər uzaq etmək, uzağa çəkmək, kənara çəkmək. *Stolu özündən uzaqlaşdırmaq. Hədəfi on metr uzaqlaşdırmaq.* // Getməyə, bir yeri tərk etməyə məcbur etmək. *Qəhrəman balaca Sabiri arıxanadan uzaqlaşdırırdı.* S.Rəhimov. [Ataş:] *Yaxşısı budur Qönçəylə Mürsəli buradan müvəqqəti uzaqlaşdırım*. Ə.Vəliyev.

2. Bir şeyin vaxtını gecikdirmək, daha uzaq bir vaxta keçirmək. *Gözlənilməz hadisə məsələnin həllini uzaqlaşdırdı.*

3. Əlaqələri kəsmək, yadlaşdırmaq. [Rüstəm bəy:] *Nə edəcəyimi indidən deyə bilmərəm, ancaq onu bilirəm ki, hər nə olsa da, var qüvvəmlə rəqibimi məhbubəmdən uzaqlaşdırardım*. Çəmənzəminli. *Onu başımdan çıxarmaq, özümdən uzaqlaşdırmaq istəyirdim.* S.Hüseyn. // Uzaqlaşmasına, əlaqəni kəsməsinə, yadlaşmasına səbəb olmaq. *Onun bu münasibəti məni ondan uzaqlaşdırdı.*

4. Qovmaq, rədd etmək, yaxın qoymamaq. *Rəhim bəy, bir bəri gəl! Allahı sevirsən... al bu on manatı da qəndə, çaya ver, bu donuzu mənim qapımdan uzaqlaşdır.* Ə.Haqverdiyev. // Eyni mənada bəzən "başından", "özündən" və s. sözlərlə. *Murad gözlərini açdı. Ayağa qalxdı, damağına hücum edən qara fikirləri özündən uzaqlaşdırmaq istədi.* S.Hüseyn. *Vaqonlar* [Rübabəni] *götürüb, sanki Gəldiyevin şərindən uzaqlaşdırmaq üçün yeyinlədi*. Mir Cəlal.

**UZAQLAŞMA** "Uzaqlaşmaq"dan *f.is.*

**UZAQLAŞMAQ** *f.* 1. Daha uzağa, uzaq məsafəyə getmək, çox aralanmaq, getdikcə uzaq olmaq. *Qəsəbədən uzaqlaşmaq. Çaydan uzaqlaşmaq. – Şəhərdən bir qədər uzaqlaşmışdıq, gördük ki, yolun kənarında bir neçə adam oturub*. C.Məmmədquluzadə. [Valeh] *ağacını çobansayağı boynunun ardına qoyub, fiştırıq çala-çala uzaqlaşdı.* Ə.Abasov. // Aralanıb getmək. *Ceyran məndən uzaqlaşıb getdi.* S.Hüseyn. *Qaratel ilə Məmməd xudahafizləşib .. uzaqlaşmışdılar.* Ə.Əbülhəsən. // Başlanmış bir şeyi buraxıb başqasına keçmək, əsil məqsəddən kənara çıxmaq. *Mətləbdən uzaqlaşmaq. Əsil məqsəddən uzaqlaşmaq. Əsas mövzudan uzaqlaşmaq*. // Yan qaçmaq, kənar qaçmaq, yaxınlaşmamaq, uzaq gəzmək, daha görüşməmək, əlaqə saxlamamaq, getdikcə yadlaşmaq. *Yoldaşlarından uzaqlaşmaq. Nə üçün hamıdan belə uzaqlaşmısan? O, yavaş-yavaş ev-eşiyindən uzaqlaşdı. – Mənim ondan ani bir surətdə və hətta bir səbəb olmadan uzaqlaşmağım bizim gələcək səadətimizi də qorxu altına ala bilər.* M.S.Ordubadi. *Burda durulmaz, çəkilib qaçmalı; Qaçmalı, vəhşətdən uzaqlaşmalı.* H.Cavid. // Durduğu və ya durmalı olduğu yeri tərk etmək, ondan aralanmaq, aralı düşmək. *Belə qorxulu vaxtda postdan uzaqlaşmaq olarmı?* H.Nəzərli.

2. Getdikcə uzaqdan eşidilmək və ya görünmək. *Gurultu səsi getdikcə uzaqlaşır. Gəminin işıqları get-gedə bizdən uzaqlaşırdı. – Seyrək-seyrək atılan güllələr uzaqlaşaraq qeyb oldu.* Ə.Vəliyev. *Səslər uzaqlaşanda, o, qanadı sınmış kimi, başı aşağı, yuvasına qayıdardı.* Mir Cəlal.

3. Zaman etibarilə uzağa getmək, üstündən çox vaxt (aylar, illər, əsrlər) keçmək. *Daşlarda, qayalarda izi qaldı; Uzaqlaşan* (f.is.) *hər əsrin*. O.Sarıvəlli.

4. *məc*. Məşğul olduğu bir işi getdikcə tərk etməyə başlamaq, atmaq, onunla daha məşğul olmamaq. *Bu kimi söhbət və mülahizələrə baxmayaraq, Qəhrəman kitabdan, yazı-pozudan uzaqlaşır, özünü çöl işinə verirdi.* S.Rəhimov.

**UZAQLIQ** *is.* 1. Məsafəcə uzunluq, məsafəcə yaxın olmama; uzaq olma, iraqlıq. *Yolun uzaqlığı. Səfərin uzaqlığı. Ulduzların uzaqlığı. Məsafənin uzaqlığı.* // İki müəyyən nöqtə arasındakı məsafə. *Mərmi uçuşunun uzaqlığı. Atış uzaqlığı.* // Uzaqda olan, uzaqlarda görünən şey, ya şeylər. *Planetlər, uçulub dağılan o dəhşətli uzaqlıqlar daima mənə qədim bir əfsanə kimi gözəl və irişilməz görünürdü.* Ə.Məmmədxanlı.

2. Zamanca, dövr etibarilə yaxın olmama, uzaq olma, aradan çox zaman keçmə. *Hadisələrin uzaqlığı.*

**UZAQLIQÖLÇƏN** *is.* Müşahidəçidən uzaq cismə (şeyə) qədər olan məsafəni bilavasitə ölçmədən müəyyən etmək üçün xüsusi cihaz. *Optik uzaqlıqölçən*. // Sif. mənasında. *Uzaqlıqölçən cihaz*.

**UZAQ-UZAQ** *sif.* Çox uzaq. *Uzaq-uzaq dağ başında; Tala-tala qar görünür*. "Koroğlu". *Uzaq-uzaq ölkələrdən; Uçub gəlir qaranquşlar.* B.Vahabzadə.

**UZAQVURAN** *sif.* Uzaq məsafələrə vuran; gülləsi, mərmisi uzaqlara çatan. *Uzaqvuran artilleriya. – Gecə-gündüz qulaq asır uzaqvuran top səsinə.* S.Vurğun. *Uzaqvuran topların nəriltisi sahildə əks-səda verdi*. M.Hüseyn.

**UZANDIRILMA** "Uzandırılmaq"dan *f.is.*

**UZANDIRILMAQ** "Uzandırmaq"dan *məch.*

**UZANDIRMA** "Uzandırmaq"dan *f.is.*

**UZANDIRMAQ** *icb*. Uzanmış hala gətirmək; uzanmağa məcbur etmək. *Xəstəni uzandırmaq.*

**UZANIB-GETMƏK** bax **uzanmaq** 3-cü mənada. *Düşərgənin* [ətrafında] *yamyaşıl pambıq sahələri uzanıb gedir*. M.İbrahimov.

**UZANIQLI** *zərf* Uzanmış halda, uzanmış vəziyyətdə. *Badam xala başını aşağı salıb əl vermədi, dinmədi, İnsafın əli uzanıqlı qaldı.* Mir Cəlal.

**UZANIŞMA** "Uzanışmaq"dan *f.is.*

**UZANIŞMAQ** *qarş*. Uzanmaq (çoxları haqqında). *Hamı uzanışıb yatdı*.

**UZANMA** "Uzanmaq"dan *f.is.*

**UZANMAQ** *f.* 1. Üfüqi və hərəkətsiz bir vəziyyət almaq, uzanmış vəziyyət almaq (yatmaq, dincəlmək və ya başqa məqsədlə). *Divanda uzanmaq. Otun üstündə uzanmaq. Üzüqoylu uzanmaq. Böyrü üstə uzanmaq. – Nahardan sonra uzandım, amma yuxum gəlmədi.* C.Məmmədquluzadə. *Qaraca qız da kölgədə uzandı və bir azdan sonra şirin yuxuya getdi*. S.S.Axundov. // Bütün bədəni ilə yerə yıxılmaq, sərilmək. *Tirtap yerə uzandı*.

2. Əlini, başını, ya bütün bədənini bir şeyə və ya bir adama tərəf uzatmaq, özünü qabağa vermək. *Uzanıb stolun üstündən kitabı götürdü. Uşaq oyuncağı görən kimi ona tərəf uzandı.*

3. Uzanıb-gedən sahə haqqında (çox vaxt "uzanıb-getmək" şəklində işlənir). *Dərəni aşdım. Meşənin içərisində cənuba doğru uzanan* (f.sif.) *daşlı-qayalı bir dağ ətəyi ilə gedirdim*. A.Şaiq. *Arxa tərəfdən ucsuz-bucaqsız geniş düzənlik uzanıb-gedirdi.* İ.Əfəndiyev. // Uzun məsafədə sıra ilə, yaxud yan-yana düzülmək.

4. Boy atmaq, boya vermək, böyümək. *Uşaq bir ildə çox uzanıb*. // Uzunlaşmaq, çoxalmaq, artmaq; sallanmaq (saç, saqqal, dırnaq və s. haqqında). *Müəllim* [Tellinin] *belindən aşağı uzanan* (f.sif.) *hörüklərinə diqqət etdi.* S.Hüseyn. [Döyüşçünün] *uzanmış* (f.sif.) *saqqalında qan laxtalanmışdı*. Ə.Vəliyev. // Daha uzun olmaq, uzununa artmaq, daha uzun görünmək. *Yollar boyunca hündür otların və ağacların kölgəsi uzanır, şərq üfüqlərindən enən xəfif qaranlıqla qovuşaraq qatılaşır*. M.İbrahimov. *Kölgələr uzanır, günəş çəkilib batmağa gedirdi.* Mir Cəlal.

5. Bir şeyə tərəf yönəlmək. *Qabarlı əllər uzanır "Zimni"yə; Köhnə dünyanı birdəfəlik boğmaq üçün*. R.Rza. *Bizim birliyimiz kəsəcək ancaq; Düyməyə uzanan o barmaqları*. B.Vahabzadə.

6. Daha sürəkli, daha uzun olmaq, yaxud görünmək. *Günlər getdikcə uzanır. – Ömrü olduqca sərgərdan dolandı; Hər saatı min il olub uzandı.* A.Səhhət. *Ömründən pay verir gecə gündüzə; Günlər uzandıqca uzanır il də.* S.Vurğun. // Bir vaxta qədər, bir müddətədək davam etmək; çox çəkmək, davam etmək. *Mübahisə bir neçə saat uzandı. Ziyafət gecə yarısına qədər uzandı. – Bu hal ilə əsrə*

*qədər müharibə uzandı; Nəticədə fədailər şanlı zəfər qazandı*. A.Səhhət. *Məclis uzandı. Hamı sevinirdi, hamı gülürdü.* S.Rəhman. // *məc.* Ləngimək, yubanmaq, təxirə düşmək. *Məsələnin həlli çox uzandı. İşin icrası bir qədər uzandı.*

7. *məc*. İz buraxaraq uzaqlaşmaq, çəkilmək, getmək. *Günəş qızıl saçlarını dərələrdən, meşələrdən yavaş-yavaş toplayaraq qərbə doğru uzanmağa başlamışdı.* A.Şaiq.

**UZAŞDIRMA** "Uzaşdırmaq"dan *f.is.*

**UZAŞDIRMAQ** *f.* Uzaqlaşdırmaq.

**UZAŞMA** "Uzaşmaq"dan *f.is.*

**UZAŞMAQ** *f.* Uzaqlaşmaq. *Yaxşıya yanaş; Yamandan uzaş*. (Ata. sözü). *Qırıldı, qaçdı, qoymayın; Gözdən uzaşdı, qoymayın.* M.Ə.Sabir. *Günəş uzaşır, kölgələr boy atır.* R.Rza.

**UZATMA** "Uzatmaq"dan *f.is.*

**UZATMAQ** *f.* 1. Daha uzun etmək; uzunluğunu, boyunu artırmaq. *Paltarın ətəyini uzatmaq. İpi bir qədər uzatmaq*.

2. Bir şeyi irəliyə doğru hərəkət etdirmək, irəli vermək, bir şeyə, ya bir adama tərəf yaxınlaşdırmaq, yönəltmək. *..Yavıqda oturan qonaqlar da stəkanlarını uzadıb xanımın stəkanı ilə çaqqıldatdılar və içdilər*. C.Məmmədquluzadə. *Ballı xala qabı eşib, bir qızarmış iri kələmdolması tapıb, oğlu Qulunun ağzına uzatdı*. Çəmənzəminli. // Əlini uzadaraq bir şeyi vermək, təqdim, ya təklif etmək. *Bir papiros çıxarıb yoldaşına uzatdı. – Zabit .. ayaqlarını qoşalaşdırıb, məktubu mənə uzatdı...* M.S.Ordubadi. *Eldarın göyərçin hinini gördükdə mən yaralı göyərçini tordan çıxarıb ona uzatdım.* M.Rzaquluzadə. *Kənd poçtalyonu Ayaza bir dəstə qəzet uzatdı*. Ə.Məmmədxanlı.

3. Çıxmasına, uzanmasına mane olmamaq; vurdurmamaq, qırxdırmamaq, kəsdirməmək. *Saqqalını* (*saçını*) *uzatmaq*. *Dırnaqlarını uzatmaq. – Arabir də papaq qoyub bığlarını uzadar; O bilir ki, bu dünyada Koroğlunun adı var*. S.Vurğun. *Gənc, gözəl bir oğlanın başının tükünü çiyninədək uzadardılar*. H.Sarabski.

4. Uzandırmaq, yatırtmaq. *Bir az sonra dizinin üstündə huşa getdiyini gördükdə Zeynəb* [Mayanı] *ehmalca yerinə uzatdı*. M.İbrahimov. *Kərimin ayağına yağlı xəmir salıb yerə uzadardılar*. H.Sarabski.

5. Vaxtını, müddətini artırmaq, bir işin davam müddətini artırmaq. *Qəbul saatlarını uzatmaq. Məşğələni yarım saat uzatdılar.*

6. Ləngitmək, təxirə salmaq, bir məsələnin, işin həllini, icrasını geriyə atmaq, gecikdirmək, daha gec vaxta keçirmək. [Nazlı:] *Fərhad qardaşın stolu üstündə şəklini görmüşəm. Niyə uzadırsan, a-az? Niyə Fərhada getmirsən?* Ə.Məmmədxanlı. // Lüzumundan artıq davam etdirmək, gecikdirmək. *Oyunu uzatmaq. İşi uzatmaq.* – [Şirin:] *Ay Çingiz, sənin bir müsbət tərəfin varsa, o da iclası uzatmamağındır*. Çəmənzəminli. *Söylədi: – Məclisi gəlin uzadaq*. H.K.Sanılı.

7. Artırmaq, yaşatmaq, davam etdirmək. *Təmiz hava insanın ömrünü uzadar. – Ömrü uzatdıqca dillənir varlıq; Bizə nələr deyir bu bəxtiyarlıq?* S.Vurğun. *Saf su ömür-gün uzadar; Bulanıq su verər azar*. M.Dilbazi.

8. Uzun danışmaq, uzunçuluq eləmək, danışarkən lazım olmayan təfərrüata yol vermək. *Sözü uzatmaq. Mətləbi uzatmaq. – Dilmanc dəxi səbir eləmədi və qoymadı Yarməhəmməd sözü uzatsın.* C.Məmmədquluzadə. *Əmrah öz nəsihətlərini çox uzatmadı.* M.Hüseyn.

**UZLAŞDIRILMA** "Uzlaşdırılmaq"dan *f.is.*

**UZLAŞDIRILMAQ** *məch.* Uyğunlaşdırılmaq, uyğun bir hala gətirilmək, müvafiqləşdirilmək, uyuşdurulmaq, həmahəng edilmək.

**UZLAŞDIRMA** "Uzlaşdırmaq"dan *f.is.*

**UZLAŞDIRMAQ** *f.* 1. Uyğunlaşdırmaq, uyğun bir hala salmaq, müvafiqləşdirmək, uyuşdurmaq, həmahəng etmək.

2. Bir şey, bir məsələ haqqında danışıb müəyyən fikrə gəlmək, bir şey haqqında razılığa gəlmək. *Hərəkət planını uzlaşdırmaq. Məsələni yuxarı təşkilatla uzlaşdırmaq.*

3. *qram.* Sözü, asılı olduğu sözlə cins, kəmiyyət, hallanma, ya şəxsə görə uyğunlaşdırmaq (b a x **uzlaşma** 2-ci mənada).

**UZLAŞMA** 1. "Uzlaşmaq"dan *f.is.*

2. *qram*. Qrammatik əlaqənin elə formasıdır ki, burada qrammatik cəhətdən tabeedici ünsürlərin hər ikisi bir qrammatik kateqoriyada olur (uzlaşma dillərin çoxunda şəxs, kəmiyyət, cins kateqoriyalarında öz ifadəsini tapır).

**UZLAŞMAQ** *f.* 1. Uyğunlaşmaq, uyğun gəlmək, müvafiq olmaq, həmahəng olmaq,

düz gəlmək. *Yeni layihə əvvəlki ilə tamamilə uzlaşır. Onun sözü işi ilə uzlaşmır.* // Sözləşmək, şərtləşmək, qərarlaşmaq, danışıb razılığını almaq. *Əvvəlcə yoldaşlarla danışıb uzlaşmaq lazımdır.*

2. *qram*. Cümlədə asılı olduğu sözün durduğu kəmiyyətdə, halda və ya şəxsdə durmaq. *Cümlədə xəbər mübtəda ilə uzlaşmalıdır.*

**UZUN** *sif.* 1. İki ucunun arası çox, çox olan (*qısa* ziddi). *Uzun ağac. Uzun ip. Uzun tir. Uzun saç.* – [Laçın] *əlində uzun bir dəyənək beş-altı baş keçi və qoyunu otarmağa aparırdı*. H.Nəzərli. *Ortada uzun, lakin ensiz ayaqaltı xalça salınmışdı*. M.İbrahimov. // Uzunluğu bir qədər (lüzumundan) artıq olan. *Uzun palto. Uzun köynək. Paltarın qolu uzundur, gödəltmək lazımdır. – Gülşad göyzəmin krepsatindən yaxası düyməli, uzun don geymiş*(*di*). Ə.Əbülhəsən. // Boyca hündür, ucaboylu. *Uzun qamət. Uzun boy. – Uzun, motalpapaqlı bir çoban, Sarxanı heç saymayır, ağzına gələni deyirdi.* M.Hüseyn.

2. Uzunsürən, çoxsürən, uzun müddət davam edən. *Uzun məruzə. Uzun tənəffüs. Uzun mübahisə. – Kəsilibdir, yoxdur səbrü qərarım; Bir saətim olub uzun illər, hey!* M.V.Vidadi. *Xülasə, uzun söhbətlər oldu, genə heç kəs bu sirdən agah ola bilmədi.* Çəmənzəminli. // Zərf mənasında. *Müəllimin getdiyi beş gündü. Bu günlər* [Telliyə] *çox uzun görünürdü.* S.Hüseyn. *..Hər dəqiqəsi bir ömür qədər uzun görünən cəbhə vuruşmasından biryolluq qurtarmaq arzusu artırdı*. H.Nəzərli. ◻ **Uzun sürmək (çəkmək)** – uzun müddət davam etmək, çox davam etmək, çox çəkmək. [Xudayar bəylə Kərbəlayı Cəfərin] *söhbəti çox uzun çəkdi.* C.Məmmədquluzadə. *Söhbət uzun sürmədi*. Ə.Vəliyev. // Sürəkli, davamlı, arasıkəsilməyən. *Təkərlərdən tükürpərdən uzun bir səs qopdu*. M.Hüseyn. *Telefon uzun bir zəng vurdu.* B.Bayramov. // *zərf* Daim, arasıkəsilmədən, həmişə. *Uzun danışmaq*. – [Səfər:] *Rəhmətliyin qızı, hələ uzun ağlayır.* C.Cabbarlı.

3. Lüzumundan artıq, təfsilatlı. *Uzun söhbət açmaq. Uzun təfərrüat. – Vuruşarkən uzun* (z.) *danışmaq mənə çox baha oturdu*. M.Hüseyn. *Uzun* (z.) *danışmayın, deyirəm sizə; Dərinizi soymaq borc olsun bizə*. S.Rüstəm.

4. *məc*. Qurtarmayan, həlli çətin, tez başa gəlməyən; dolaşıq, yorucu. *Uzun iş. Məsələ uzundur. Uzun həngamədir. – Bunların hamısı* [evin təmirinə hazırlıq görülməsi] *uzun işdi.* C.Məmmədquluzadə. [Qaraş Mayaya:] *Sağ ol ki, görən kimi ulduzun barışdı, axı, gəlin-qayınana işi uzun işdir*. M.İbrahimov.

5. **Uzunu** şəklində – 1) uzunluğu, uzununa ölçüsü, boyu. *Xalçanın eni bir, uzunu iki metrdir. – Tövlənin iyirmi səkkiz arşın uzunu, yeddi arşın yarım enidir.* Qantəmir; 2) ...boyunca, ...davamınca, ...uzunluğunda. *Küçə uzunu bir-birinin ardınca maşınlar düzülüb. Zal uzunu xalçalar döşənib. – Hər iki divar uzunu ağ parusin örtüklü stullar düzülmüşdü.* M.Hüseyn. ◻ **İl uzunu** – bütün il, ilboyu, bütün il müddətində. *İl uzunu çalışmaq. Tədqiqat il uzunu davam etdi. İl uzunu onu görməmişəm.* – [Alı Səfi bəyə:] *Bizi xam tovlamışdın, il uzunu işlədib, bir qəpik də vermirdin... Daha indi bəy-zad dəbdən düşdü!* Çəmənzəminli. **İllər uzunu** – illərcə. *Ey illər uzunu çiçəksiz, otsuz; İlanlar yatağı olan Mil düzü!* M.Müşfiq.

◊ **Uzun sözün qısası** *ara s. mənasında* – xülasə, bir sözlə, müxtəsər (danışılanlara yekun vurma məqamında işlənir). [Hacı Əhməd Almaza:] *Bacıqızı, uzun sözün qısası, biz səndən incimişik*. C.Cabbarlı.

**uzun**... – mürəkkəb sözlərin uzunluq bildirən birinci tərkib hissəsi; məs.: uzunayaqlı, uzunbığlı, uzunsürən.

**UZUNAYAQ(LI)** *sif.* Ayaqları uzun olan. *Uzunayaq durna.*

**UZUNBALDIR(LI)** *sif.* Baldırları uzun və nazik olan.

**UZUNBAŞ(LI)** *sif.* Başı uzunsov olan.

**UZUNBIĞ(LI)** *sif.* Bığları uzun olan, uzun bığ qoymuş. *Uzunbığ kişi. – Məmməd bəyin ilk zərbəsindən uzunbığlı, sallaq birçəkli bir sərkərdənin başı qələm kimi atıldı.* Çəmənzəminli.

**UZUNBOĞAZ(LI)** *sif.* Boğazı uzun olan, uzun boğazlı. *Uzunboğaz adam. Uzunboğaz şüşə. Uzunboğaz corab. – Stolun qabağında dümdüz oturmuş uzunboğaz, arıq adam qəti dedi..* M.Hüseyn. *Güllüoğlu Xalıqverdinin əynində nimdaş göy çuxa, ayağında uzunboğaz köhnə çəkmələr vardı*. Ə.Vəliyev.

**UZUNBOY(LU)** *sif.* Boyu uzun olan, boyca hündür, ucaboy. *Dəyirman üstə çiçək; Yarpağı ləçək-ləçək; Qardaş bir qız sevibdir; Uzunboy, qarabirçək.* (Bayatı). *Uzunboy, ağbəniz, alagöz Gülbadamı qız ikən kənddə çox adam istəyirdi*. N.Nərimanov.

**UZUNBOYUN** *sif.* Boynu uzun olan. *Uzunboyun adam*.

**UZUNBURUN[1]** *sif.* Burnu uzun olan, uzun burunlu. *Uzunburun adam. Uzunburun balıq.*

**UZUNBURUN[2]** *is.* Bəzi rayonlarda ağcaqanadın bir adı. *Revolveri, qoçunu Badikubə məmləkətində; Uzunburun milçəyi Saliyanda görməli imiş.* M.Ə.Sabir.

**UZUNBUYNUZ(LU)** *sif.* Buynuzları uzun olan. *Uzunbuynuzlu camışlar .. Cənubi Çində, Böyük Okeanda və İndoneziya adalarında yaşayır.* A.Ağabəyli.

**UZUNCA** *sif.* Çox uzun. *Uzunca ağac. Uzunca dəhliz. Uzunca zal. Uzunca boru*. // Çox müfəssəl, çox uzun, geniş. *Ceyran burada mənə uzunca bir izahat verdi.* S.Hüseyn. *Görünür, anamla uzunca söhbət etmisən..* S.S.Axundov.

**UZUN-CAYDAQ** b a x **uzundraz**. *Uzuncaydaq məmur .. komendanta sarı dönərək sakit, lakin amiranə bir səslə dedi.* M.Hüseyn.

**UZUNÇƏKƏN** b a x **uzunsürən**.

**UZUNÇU** b a x **uzundanışan**. *Uzunçunun biridir*. – *Bu usta əvvəlkindən də uzunçu idi.* "Koroğlu". [Feldşer] *çox uzunçu, lağ-lağ, həm də qaba bir adamdı*. M.Hüseyn. [Nəsirov:] *Canım, sən nə uzunçu adamsanmış? Yaxşı, yaxşı, get işinə.* S.Rəhman.

**UZUNÇULUQ** *is.* Uzun danışmaq xasiyyəti, söhbəti lüzumsuz yerə uzatma. *Əlyarov Gülpərinin bu uzunçuluğunu bəyənmirdi.* M.Hüseyn. *Lakin Firəngizin bircə baxışı əyləşənlərin canını* [müvəkkilin] *uzunçuluğundan qurtardı*. B.Bayramov. ☐ **Uzunçuluq etmək** – söhbəti, mətləbi lüzumundan artıq uzatmaq. [Mirzə Turab Cavada:] *Yaxşı, yaxşı, yazaram, çox uzunçuluq eləmə.* B.Talıblı. // Kitabda, yazıda, danışıqda, nitqdə sözlərin lüzumundan artıq olması; sözçülük. *Əsərdə ritorik təsvirlər, ricətlər və uzunçuluq yoxdur.* M.İbrahimov.

**UZUNDALĞALI** *sif.* Dalğaları çox uzun olan. *Uzundalğalı radiasiya*. // Uzun dalğalarda işləyən, uzun dalğaları tutan. *Uzundalğalı radiostansiya. Uzundalğalı radioaparat*.

**UZUNDANIŞAN** *sif.* Çoxdanışan, naqqal, gəvəzə, uzunçu.

**UZUNDƏRƏ** *is. mus.* Azərbaycan xalq oyun havalarından birinin adı. [Mirzağa:] *Mən yalnız* "*Uzundərə*" *oynaya bilərəm.* S.Hüseyn. [Birisi:] *Ay Güləfşan,* "*Uzundərə*" *çal, Sənəm bacı oynayacaq*. B.Talıblı.

**UZUNDRAZ** *sif. dan.* Boyu çox uzun, arıq və yöndəmsiz, uzuncaydaq. *Uzundraz zabit* [Vəzirovu] *xüsusi salonda gözləyirdi.* M.İbrahimov. *Bayram şənliklərində* [Yalıncaq da] *hamıdan qəşəng geyinib, özü kimi uzundraz, arıq yabısını zınqrovlar, ipək qotazlarla bəzər*(*di*).. M.Rzaquluzadə.

**UZUNƏTƏK(Lİ)** *sif.* Ətəyi uzun, uzun ətəkli. [Ənisə:] ..*Uzunətək arxalığımla dikdaban başmağımı da geyərəm*. S.Hüseyn.

**UZUNGƏRDƏN(Lİ)** *sif.* Gərdəni, boynu, boğazı uzun olan.

**UZUNGÖVDƏLİ** *sif.* Gövdəsi uzun olan.

**UZUNKİRPİK(Lİ)** *sif.* Kirpikləri uzun olan, uzun kirpikli. Uzunkirpikli qiz. – [Əhməd:] *Qara saçları, eşqlə dolu uzunkirpikli gözləri, ərəbi burnu xoşuma gəldi*. T.Ş.Simurq. *İlkin mən uzunkirpikli, iri qara gözlərini çevikcə dolandırıb gəzdirən, qol-qanad açıb dirçələn Həcəri qucağıma alıb, o üz-bu üzündən öpdüm..* S.Rəhimov.

**UZUNQANAD(LI)** *zool.* 1. *sif.* Qanadları uzun olan. *Uzunqanadlı quşlar*.

2. *İs. mənasında.* **Uzunqanadlılar** – uzunqanadlıların və milçəkquşuların daxil olduğu quşlar dəstəsinin adı.

**UZUNQILÇA(LI), UZUNQIÇ(LI)** *sif.* Qılçaları (qıçları) uzun olan. *Rəhimli qulac-qulac addımlar atan uzunqılça təhkimçinin arxasından güclə çatırdı.* İ.Hüseynov.

**UZUNQOL(LU)** *sif.* Qolları uzun olan. [Arvadın] *əynində .. uzunqol bənöyüş çit köynək vardı.* Ə.Vəliyev.

**UZUNQULAQ** 1. *sif.* Qulaqları uzun olan, uzun qulaqlı. *Uzunqulaq tula*.

2. *is. evf.* Eşşək. [Aslanın] *dünya malından bir uzunqulağı, bir də .. iki keçidən başqa heç bir şeyi yox idi*. C.Cabbarlı. *Camal kişi yedəyində odun yüklü at, uzunqulaq həyətə girdi*. Ə.Vəliyev.

3. *məc.* Söyüş mənasında işlənir.

**UZUNQUNC** *sif.* Quncları uzun, uzun qunclu; uzunboğaz. [Səmədin] *uzunqunc çəkmələri, qara göndən tikilmiş əlbisəsi və qoltuğundakı portfel hamının diqqətini cəlb edirdi*. B.Talıblı. *Uzunqunc çəkməsinin ta üzünə kimi enən nimdaş paltosunda Qara kişi əslində olduğundan daha da boylu və enli görünürdü*. Ə.Əbülhəsən.

**UZUNQUYRUQ(LU)** *sif.* Quyruğu uzun olan. [Ovçunun] *Al! – deməsi ilə tulanın yerindən qopması və uzunquyruq iri bir qırqovul xoruzunun qaqqıldayaraq şiddətli bir pırıltı ilə qalxması bir oldu.* M.Rzaquluzadə. [Maşının] *yaxınlaşdığını görən uzunquyruq sağsağanlar çığırışıb uçur, uzaqda başqa ağaca qonurdu*. H.Seyidbəyli.

**UZUNLADICI** *sif.* Uzun edən, uzunluğunu artıran. *Uzunladıcı məftil*.

**UZUNLAMASINA** bax **uzununa**. [Səmədin] *üst dodağı uzunlamasına iki qat açılıb, yenə burnunun dibinə çəkildi*. B.Talıblı.

**UZUNLAŞMA** "Uzunlaşmaq"dan *f.is.*

**UZUNLAŞMAQ** *f.* Uzun olmaq, boyca artmaq, getdikcə uzun olmaq, boya vermək. *Uşaq bir-iki ilin içində yaman uzunlaşıb.*

**UZUNLATMA** "Uzunlatmaq"dan *f.is.*

**UZUNLATMAQ** *f.* Uzun etmək, uzunluğunu, boyunu artırmaq, uzunlaşdırmaq.

**UZUNLİFLİ** *sif.* Lifləri uzun, uzun lifləri olan. *Uzunlifli pambıq.*

**UZUNLUQ** *is.* 1. Uzun şeyin halı. *Yolun uzunluğu. İlanın uzunluğu bir metrdən artıqdır*. – [Həsən:] *Vay! Oğlan, bu uzunluqda da isim olurmu?* H.Nəzərli. *Bu xəndək bir kilometr uzunluğu, qırx metr eni, otuz metr dərinliyi olan nəhəng bir dərədən ibarətdir*. Ə.Sadıq.

2. *məc*. Davamlılıq, sürəklilik. *Söhbətin uzunluğu bizi yordu*.

**UZUNLÜLƏ** *sif.* Lüləsi uzun, uzun lüləli. *Uzunlülə tüfəng*.

**UZUNMÜDDƏTLİ** *sif.* Uzun müddəti nəzərdə tutan, uzun müddət davam edən; uzun müddətə verilmiş. *Uzunmüddətli ezamiyyət. Uzunmüddətli iş. Uzunmüddətli borc*.

**UZUNÖMÜRLÜ** *sif.* 1. Ömrü uzun, uzun ömür sürmüş, çox yaşamış. *Azərbaycan uzunömürlülər* (is.) *diyarıdır*.

2. Uzun müddət işləyə bilən, çox davamlı, çox yaşaya bilən. *Mühərrikdə qoyulmuş yeni izolə korpusu daha etibarlı, rütubətə davamlı və uzunömürlüdür.*

**UZUNÖMÜRLÜLÜK** *is.* Uzun ömür, uzun həyat, uzun, çox yaşama; ömrün uzunluğu.

**UZUNSAÇ(LI)** *sif.* Saçı uzun, uzun saç qoymuş, saçlarını uzatmış. *Uzunsaç oğlan. – Həsən küçəyə çıxar-çıxmaz uzunsaçlı, ..qırmızı köynək geymiş bir studentə rast gəldi.* Çəmənzəminli. *Balaca, uzunsaç, uzuntuman, başmağını sürütləyən bir qız uşağı Vahidin boynuna atıldı.* Mir Cəlal.

**UZUNSAQQAL(LI)** *sif.* Saqqalı uzun, saqqalını uzatmış. *İlyas uzunsaqqallı, dolaşıqsaçlı, ağırgövdəli bir qoca idi.* Çəmənzəminli. *Qapını açan uzunsaqqal, arıq bir adamdı*. S.Rəhman.

**UZUNSİFƏT(Lİ)** *sif.* Sifəti uzunsov, sifəti uzun. *Qatırçıların arasında gövdəsi yumru, uzunsifət, ağsaqqal bir kişi var idi.* Mir Cəlal.

**UZUNSOV** *sif.* Bir qədər uzun, uzuntəhər. *Uzunsov sifət. Uzunsov otaq. – Xalis palıd ağacından qayrılmış və təzəcə alınmış yazı stoluna bitişik olan uzunsov stolun üstünə yaşıl mahud salınmışdı*. Ə.Vəliyev. [Rəşid:] *Biz dəhlizi keçəndən sonra geniş, uzunsov bir zala girdik.* İ.Hüseynov.

**UZUNSOVLUQ** *is.* Uzunsov şeyin halı.

**UZUNSÜRƏN** *sif.* Çox sürən, uzun müddət davam edən; uzun, sürəkli, davamlı. *Uzunsürən xəstəlik. Uzunsürən müddət. Uzunsürən iclas. – Nəhayət, uzunsürən səyahətimiz bitir*. M.İbrahimov.

**UZUNTƏHƏR** *sif.* Bir qədər uzun; uzunsov.

**UZUNUNA** *zərf* Uzunluq cəhətdən; boyuna. *Taxtanı uzununa yonmaq. Parçanın uzununa ölçüsü*.

**UZUN-UZADI** *sif.* və *zərf* Çox uzun. *Uzun-uzadı söhbət. Uzun-uzadı fikirləşmək. – Küləkli qar, yağış yağar uzun-uzadı yaylağa; Köçər o vaxt el-oba, enər tamamı qışlağa*. A.Səhhət. *Mahru ilə uzun-uzadı danışmaq .. mümkün olmadı*. M.S.Ordubadi.

**UZUN-UZUN** *sif.* və *zərf* Çox uzun. *..Vəkillər yanlaricə uzun-uzun ərizələr, siyahılar gətirmişdilər.* C.Məmmədquluzadə. *Uzun-uzun kölgələr küçələri çal-çarpaz doğrayıb bir-birinə qarışırdı.* Ə.Məmmədxanlı.

**UZUNYARPAQ(LI)** *sif. bot.* Yarpaqları uzun, uzunsov olan (bitki). *Uzunyarpaq iydə.*

# Üü

**Ü** Azərbaycan əlifbasının iyirmi doqquzuncu hərfi və bu hərflə işarə olunan saitin adı.

**ÜÇ** *say* İkidən sonra gələn ədəd – 3.

**üç-üç** *zərf* Hər dəfə üç dənə, hər adama üç dənə. *Üç-üç sıraya düzmək. – Həsənqulu bəy, Rza, Əsgər, Həsən və xor daxil olurlar. Sonra səhnənin ortasında üç-üç durub guya söhbət edirlər kimi oxuyurlar*. Ü.Hacıbəyov.

**ÜÇAÇILAN** b a x **üçatılan**. *Onların tüfəngləri beşaçılan və ya üçaçılan idi.* P.Makulu.

**ÜÇADAMLIQ** *sif.* Üç adam üçün olan, üç nəfər üçün nəzərdə tutulmuş; üçnəfərlik. *Üçadamlıq yer. Üçadamlıq palata. Üçadamlıq yemək.*

**ÜÇAKTLI** b a x **üçpərdəli**.

**ÜÇARŞINLIQ** *sif. köhn.* Üç arşın uzunluğunda olan.

**ÜÇARVADLI** *sif. köhn.* Keçmiş məişətdə: üç arvadı olan, üç arvad saxlayan. // İs. mənasında. *Əgər iki arvad saxlamaq qəbahətdirsə, bəs öz kəndinizdəki üçarvadlıları niyə daşqalaq eləmirsiniz.* Ə.Vəliyev.

**ÜÇARVADLILIQ** *is. köhn.* Üç arvadı olma, üç arvad saxlama.

**ÜÇATILAN** *is. dan*. Xəzinəsi üç patron tutan silah (tüfəng); üçaçılan. *Fərman üçatılanı əlində atıb-tutdu*. Ə.Abasov.

**ÜÇATLI** *sif.* Üç at qoşulmuş, üç at qoşulan. *Üçatlı fayton.*

**ÜÇATOMLU** *sif.* Üç atomdan ibarət olan. *Üçatomlu birləşmə.*

**ÜÇAYAQ** *is.* Üç ayaq üstündə duran şey (stol və s.); üçayaqlı, sacayaq. *Fotoaparat üçün üçayaq. Qazanı üçayaqdan asmaq.*

**ÜÇAYAQLI** 1. *sif.* Üç ayağı olan, üç ayaq üstündə duran; üçqıçlı. *Üçayaqlı masacıq.*

2. B a x **üçayaq**.

**ÜÇAYLIQ** *sif.* 1. Üç ay üçün düzəldilmiş, üç aylıq müddətə nəzərdə tutulmuş, yaxud üç ay ərzində olmuş; rüblük. *Üçaylıq plan. Üçaylıq məlumat. Üçaylıq ezamiyyət. – Kəndlərimizdə məktəblər açırıq, hələlik orda üçaylıq, altıaylıq müəllimlər kursunu qurtaranlar dərs deyir.* İ.Şıxlı.

2. Yaşı üç ay olan, üç ay əvvəl doğulmuş. *Üçaylıq uşaq. Üçaylıq quzu.*

**ÜÇBARMAQLI** *sif.* Əlində və ya ayağında ancaq üç barmağı olan.

**ÜÇBAŞLI** *sif.* Üç başı, təpəsi olan. *Üçbaşlı dağ.*

**ÜÇ-BEŞ** *say.* Bir neçə. *Üç-beş manat pul. Üç-beş nəfər. Üç-beş günlük iş. – Gər nəsib olsa övdət eylərkən; Qalarız burda biz üç-beş gün*. H.Cavid.

**ÜÇBƏNDLİ** *sif. ədəb*. Üç benddən ibarət olan. *Üçbəndli şeir.*

**ÜÇBİR** *zərf* Üç-üç, üçər-üçər. *Adamlar dəstə-dəstə – üçbir, beşbir bağda gəzir, söhbət edirdilər*. M.İbrahimov. *İndi tez-tez sağ-sağana, qarğaya, tək-tək, ikibir, üçbir uçuşan göyərçinlərə rast gəlirik.* M.Rzaquluzadə.

**ÜÇBUCAQ(LI)** 1. *is.* Üç bucağı olan həndəsi cisim, üçkünclü cisim. *Ax! Bu dəmir ağaclar; Həndəsi üçbucaqlar; Dünyanın o başını; Çəkib evlərə bağlar...* B.Vahabzadə.

2. *sif.* Üç bucağı olan. *Üçbucaqlı fiqur.*

**ÜÇÇARXLI** *sif.* Üç çarxı (təkəri) olan. *Üççarxlı uşaq velosipedi*.

**ÜÇCƏ** *say* Üç, ancaq üç. *Üçcə manat pulum qalıb. – Bürcəliyev əmr verdiyi vaxtdan cəmisi üçcə saat keçmədi ki, Bəbirbala mühəndis Arif Bəylərzadəni taparaq maşına əyləşdirib, idarəyə gətirdi*. S.Rəhimov.

**ÜÇCƏRGƏLİ** *sif.* 1. Üç cərgə əmələ gətirən, üç cərgədə yerləşən. *Üçcərgəli tikiş.*

2. *k.t.* Üç cərgə toxum əkmək üçün olan; üç cərgə əkini becərən (kənd təsərrüfatı maşınları haqqında). *Üçcərgəli toxumsəpən maşın.*

**ÜÇCİLDLİ** *sif.* Üç cilddən ibarət olan; üçcildlik. *Üçcildli* "*Azərbaycan ədəbiyyatı tarixi*".

**ÜÇCİLDLİK** 1. B a x **üçcildli**. *Üçcildlik* "*Rusca-azərbaycanca lüğət*".

2. *is.* Üç cilddən ibarət kitab. *Yazıçının üçcildliyi.*

**ÜÇDƏBİR** *say* Bir şeyin üçdə bir hissəsi.

**ÜÇDƏFƏLİK** *sif.* Üç dəfədə icra olunan, üç dəfədə həyata keçirilən. *Üçdəfəlik yemək.*

**ÜÇDİLLİ** *sif.* 1. Üç dil bilən, üç dildən istifadə edən.

2. Üç dildə tərtib olunmuş, üç dili ehtiva edən. *Üçdilli lüğət.*

**ÜÇDİŞLİ** *sif.* Üç dişi olan. *Üçdişli yaba.*

**ÜÇDORLU** *sif.* Üç doru olan. *Üçdorlu gəmi.*

**ÜÇ-DÖRD** *say* Bir neçə, üç və ya dörd. *Üç-dörd günlüyə getmək. Üç-dörd ədəd gül.* – [Kələntərli:] *Gərək gündə gəlib, üç-dörd saat bu meşin qapının dalında durub, boynunu burub gözünü döyəsən.* İ.Hüseynov.

**ÜÇDÜYMƏ(Lİ)** *sif.* 1. Üç düymə ölçüsündə olan. *Üçdüymə mıx. Üçdüymə taxta.*

2. Üç düyməsi olan. *Üçdüyməli pencək.*

**ÜÇƏM** *sif.* və *zərf məh*. Bir dəfədə üç (üç bala doğan heyvan – əsasən qoyun haqqında). *Həmişə əlləri cibində olan cavan çoban təklif edirdi ki, ..üçəm qoyunlar yaxın yerlərdə otlarsa, hər yüz qoyundan orta hesabla iki yüz quzu almaq olar.* Ə.Vəliyev. [Musa Firəngizə:] *Elə seçmə qoyunlar ki çoxusu əkiz, bəzisi də həmişə üçəm doğur.* B.Bayramov.

**Üçəm-üçəm** bax **üç-üç**.

**ÜÇƏSRLİK** *sif.* Üç əsr (üç yüz il) tarixi olan, üç əsr davam edən; üçyüzillik. *Üçəsrlik dövr. Abidənin üçəsrlik tarixi var.*

**ÜÇFAİZLİ** *sif.* 1. Bir şeyin üç faizini təşkil edən. *Üçfaizli gəlir.*

2. Üç faiz gəlir verən. *Üçfaizli dövlət istiqrazı.*

3. Tərkibində üç faiz hər hansı maddə olan. *Üçfaizli məhlul.*

**ÜÇFAZALI** *sif. elektr.* Üçfazalı dəyişən cərəyanla bağlı olan. *Üçfazalı transformator. Üçfazalı elektrik xətti.*

◊ **Üçfazalı cərəyan** *elektr*. – eyni tezlikli və amplitudalı, lakin fazaya görə $^{1}/_{3}$ dövrlə fərqlənən üç birfazalı dəyişən cərəyan sistemi. *Üçfazalı cərəyan dövrlərində ayrı-ayrı fazaların cərəyanları hər an üçün müxtəlif olur*. P.Rüstəmzadə.

**ÜÇGEDİŞLİ** *sif. idm.* Üç gedişdə həll olunan, üç gedişlə qurtaran. *Üçgedişli kombinasiya.*

**ÜÇGÖZ(LÜ)** *sif.* Üç gözü (otağı) olan. *Üçgözlü mənzil.*

**ÜÇGUŞƏ(Lİ)** *sif.* Üç guşəsi, üç bucağı olan; üçkünc(lü).

**ÜÇGÜL** *sif.* Üçbucaqlı, üçguşəli.

**ÜÇGÜNLÜK** *sif.* Üç gün sürən, üç gün davam edən, yaxud üç gün tələb edən. *Üçgünlük möhlət. Üçgünlük istirahət. Üçgünlük yol. Üçgünlük iş.* // Üç günə çatan, kifayət edən. *Üçgünlük ehtiyat.*

**ÜÇHECALI** *sif.* Üç hecası olan. *Üçhecalı söz.*

**ÜÇHƏDLİ** *sif.* Üç həddi olan. *Üçhədli rəqəm.*

**ÜÇHƏFTƏLİK** *sif.* Üç həftə davam edən, üç həftə çəkən. *Üçhəftəlik iş.* // Üç həftə üçün nəzərdə tutulmuş, üç həftə kifayət edən. *Üçhəftəlik ərzaq.*

**ÜÇHİSSƏLİ** *sif.* Üç hissədən ibarət olan. *Üçhissəli əsər.*

**ÜÇXALLI** bax **üçlük** 2-ci mənada.

**ÜÇXƏTLİ** bax **üçmilli**.

**ÜÇİLLİK** *sif.* 1. Üç il sürən, üç il müddətli, üç il davam edən. *Üçillik məktəb. Üçillik hərbi xidmət.* // Üç il müddətinə tərtib edilmiş, üç ili nəzərdə tutan. *Üçillik plan.*

2. Üç yaşında olan; üçyaşar. *Üçillik at. Üçillik ağac.*

3. Üç ildən qalma, üç il ömrü olan. *Üçillik şərab.*

**ÜÇKİLOMETRLİK** *sif.* 1. Üç kilometr uzunluğunda olan, məsafəsi üç kilometr olan. *Üç kilometrlik yol.*

2. *coğr.* Santimetrdə üç kilometr miqyası olan. *Üçkilometrlik xəritə.*

**ÜÇKÜNC(LÜ)** bax **üçguşəli**. *Ağ qoçların boyunlarından .. ara-sıra gözmuncuğu, yaşıl meşindən tikilmiş, içi dualı üçkünc pitik asardılar.* H.Sarabski.

**ÜÇQAPILI** *sif.* Üç qapısı olan. *Üçqapılı şifoner. Üçqapılı zal.* – [Hacı Sultan] *üçqapılı böyük bir mağazaya malik idi.* S.Hüseyn.

**ÜÇQAT(LI)** *sif.* 1. Üç qatı olan; üçmərtəbəli. *Üçqat(lı) ev.*

2. Bir-biri üzərində üç qat olan; üçlaylı. *Üçqat xəmir. Üçqat dikt.*

**ÜÇQƏPİKLİK** *sif.* Üç qəpiyə dəyən, üç qəpik qiymətində olan. *Üçqəpiklik marka.* // *is*. Üç qəpik dəyərində olan metal pul.

**ÜÇQIÇLI** bax **üçayaqlı**.

**ÜÇQRAMLIQ** *is.* Üç qram ağırlığında olan çəki daşı.

**ÜÇLAYLI** *sif.* 1. Üç laydan (qatdan, təbəqədən) ibarət olan. *Üçlaylı karton.*

2. Üç layı olan, üç tayı olan. *Üçlaylı güzgü.*

**ÜÇLƏMƏ** "Üçləmək"dən *f.is.*

**ÜÇLƏMƏK** *f.* 1. Üçə çatdırmaq. *Uşağı üçləmək.*

2. Üç dəfə artırmaq, üçə vurmaq.

3. Üç yerə bölmək.

**ÜÇLÜK** 1. B a x **üçmanatlıq** 1-ci mənada. [Hafizə xanım:] *Mənə deyir, üçlüyü cibimdən salıb itirmişəm*. Ə.Haqverdiyev.

2. *is*. Kart oyununda üçxallı kağız.

3. *sif*. Üç nömrəli. *Üçlük mıx. Üçlük taxta.*

4. *is*. Üç çalğıçıdan ibarət musiqiçilər dəstəsi; trio. *Azərbaycan xalq çalğı alətləri üçlüyü*. // Üç nəfərdən ibarət ansambl. *Banduristlər üçlüyü.*

5. *is*. Bir iş üçün təyin edilmiş üç şəxsdən ibarət komissiya, ya müvəqqəti orqan. *Rayonda təcili tədbir üçün üçlük düzəldilmişdir*. Mir Cəlal.

**ÜÇLÜLƏ** *is*. İki üst lüləsinin içi hamar (saçma üçün), üçüncü – alt lüləsi isə yivli (güllə üçün) olan ov tüfəngi.

**ÜÇMANATLIQ** 1. *is. köhn*. Üç manat qiymətində olan kağız pul; üçlük. *Üçmanatlığı xırdalamaq*.

2. *sif*. Üç manata dəyən, üç manat qiymətində olan. *Üçmanatlıq bilet.*

**ÜÇMƏCHULLU** *sif. riyaz*. Üç məchulu olan. *Üçməchullu tənlik.*

**ÜÇMƏNZİLLİ** b a x **üçotaqlı**.

**ÜÇMƏRTƏBƏ(Lİ)** *sif*. Üç mərtəbəsi olan; üçqat. *Üçmərtəbəli bina. – Nəhayət, fayton Sovet küçəsində üçmərtəbəli bir evin qarşısında dayandı*. Ə.Məmmədxanlı.

**ÜÇMİLLİ** *sif*. Üç mil (xətt) çəkilmiş, üç mili (xətti) olan; üçxətli. *Üçmilli dəftər.*

**ÜÇMİLYONLUQ** *sif*. Üç milyondan ibarət olan. *Üçmilyonluq ordu.*

**ÜÇMİNLİK** *sif*. Sayı üç min olan, üç mindən ibarət. *Üçminlik qoşun.*

**ÜÇMOTORLU** *sif*. Üç motoru olan, üç motorla işləyən. *Üçmotorlu təyyarə.*

**ÜÇNƏFƏRLİK** b a x **üçadamlıq**. *Üçnəfərlik mehmanxana nömrəsi.*

**ÜÇNÖVBƏLİ** *sif*. Üç növbədə görülən, üç növbəsi olan. *Üçnövbəli iş.*

**ÜÇOXLU** *sif*. Üç oxu olan. *Üçoxlu trolleybus*.

**ÜÇOTAQLI** *sif*. Üç otağı olan; üçgöz(lü). *Üçotaqlı mənzil* (*ev*).

**ÜÇÖLÇÜLÜ** *sif*. 1. Üç ölçüsü olan, üç ölçü ilə (uzunluq, en, hündürlük) təyin edilən.

2. *mus*. Üç ritmik ölçüdən ibarət olan. *Üçölçülü takt* (*vəzn*).

**ÜÇPƏNCƏRƏLİ** *sif*. Üç pəncərəsi olan. *Üçpəncərəli otaq.*

**ÜÇPƏRDƏLİ** *sif*. Üç pərdədən (hissədən) ibarət olan. *Üçpərdəli pyes. Üçpərdəli tamaşa.*

**ÜÇPİLLƏLİ** *sif*. 1. Üç pilləsi olan. *Üçpilləli pilləkən.*

2. Üç hissədən, üç pillədən ibarət olan. *Üçpilləli raket.*

**ÜÇPLANLI** *sif*. Üç planı, üç tərəfi olan; üç planda yerləşmiş. *Üçplanlı dekorasiya.*

**ÜÇPUDLUQ** *sif*. Üç pud ağırlığında olan, üç pud tutan. *Üçpudluq daş. Üçpudluq kisə*. // *İs. mənasında*. Üç pud ağırlığında olan çəki daşı. *Üçpudluğu qapana qoymaq.*

**ÜÇRƏQƏMLİ** *sif*. Üç rəqəmdən ibarət olan. *Üçrəqəmli ədəd.*

**ÜÇRƏNGLİ** *sif*. Boya tərkibi üç rəngdən ibarət olan, yaxud üç müxtəlif rəngli hissədən ibarət olan. *Üçrəngli bayraqcıq. Üçrəngli çiçək. – Azərbaycanın üçrəngli, aylı-ulduzlu dövlət bayrağı ilə yanaşı, xalq mənəviyyatının parlaq rəmzi kimi qüdrətli şairimiz Şəhriyarın sənət və gözəllik bayrağı da qədim Azərbaycan torpağı üzərində əbədi dalğalanacaqdır*. B.Nəbiyev.

**ÜÇSAATLIQ** *sif*. Üç saat davam edən və ya davam etmiş, üç saat üçün müəyyən edilmiş; üç saat vaxt tələb edən. *Üçsaatlıq iş. Üçsaatlıq iclas.*

**ÜÇSƏSLİ** *sif. mus*. Üç səslə oxunan, üç səs üçün yazılmış. *Üçsəsli xor*. // İs. mənasında. [Akkordlardan] *ən sadəsi üçsəslilərdir: major üçsəslisi, minor üçsəslisi və başqaları*. "İbtidai musiqi nəzəriyyəsi".

**ÜÇSİMLİ** *sif. mus*. Üç simi olan. *Üçsimli musiqi aləti.*

**ÜÇSİNİFLİ** *sif. köhn*. Üç sinifdən ibarət olan. *Üçsinifli məktəb.*

**ÜÇŞAHILIQ** *is. köhn.* 15 qəpiklik sikkə (pul).

**ÜÇTAKTLI** *sif. mus*. Üç takt davam edən, üç taktdan ibarət olan. *Üçtaktlı fasilə.*

**ÜÇTARLALI** *sif. k.t.* Üçtarlalıq əsasında olan. *Üçtarlalı əkin sistemi.*

**ÜÇTARLALIQ** *is. k.t.* Əkin yerini üç hissəyə bölüb bir hissəsini əvvəlcə payızlıq, sonra yazlıq əkməkdən, üçüncü il isə herikə qoymaqdan ibarət köhnəlmiş növbəli əkin üsulu.

**ÜÇTƏRƏFLİ** *sif*. Üç tərəfin iştirakı ilə olan, hər üç tərəf üçün məcburi olan; qarşılıqlı. *Üçtərəfli müqavilə. Üçtərəfli danışıqlar.*

**ÜÇTİNLİ** *sif.* Üç tini olan; üçüzlü. *Üçtinli süngü.*

**ÜÇTONLUQ** *sif.* Üç ton ağırlığında yük götürən. *Üçtonluq avtomobil. – Bəzən quru ot yüklənmiş üçtonluq maşınlara da təsadüf olunur.* Ə.Vəliyev. // Üç ton ağırlığında olan. *Üçtonluq yük.* // Üç ton tutan. *Üçtonluq çən.*

**ÜÇULDUZ(LU)** *sif.* Üzərində üç ulduz şəklində fərqlənmə nişanı olan; üçillik. *Üçulduz*(*lu*) *konyak.*

**ÜÇÜN** *qoş.* Feillərdən, adlıq və ya yiyəlik halında olan isimlərdən, şəxs, qayıdış və işarə əvəzliklərindən əvvəl gələrək, həmin sözlərlə aşağıdakı mənaları ifadə edir: 1) səbəb bildirir: ...görə, ...səbəbilə. *Xəstə olduğum üçün sizə gələ bilmədim.* – [Lətifə] *bəlkə peşmanlıq çəkdiyi üçün ağlayırdı.* M.Hüseyn. *Komandiri ayağından ağır yaralandığı üçün xəstəxanaya apardılar.* Ə.Vəliyev; 2) məqsəd, qayə bildirir. *Sizi görmək üçün gəldim. – Ailəni saxlamaq üçün başqa əlac yox idi.* A.Şaiq. *Qadın körpəsini xilas etmək üçün .. uzaqlaşır.* Ə.Məmmədxanlı; 3) uğrunda, yolunda. *Vətən üçün canını vermək;* 4) aidiyyət bildirir. *Özüm üçün ayaqqabı aldım. – Məhkəmə sədri üçün məsələ aydın idi.* S.Hüseyn.

**ÜÇÜNCÜ** "Üç"dən *sıra s. Üçüncü mərtəbə. Üçüncü cərgə. Üçüncü adam.*

**ÜÇÜZLÜ** *sif.* Üç üzü olan; üçtinli. *Üçüzlü yeyə. – Günəş şüası üçüzlü prizmadan keçərək öz tərkib hissələrinə ayrılır.* A.Ələkbərov.

**ÜÇVALENTLİ** *sif. kim.* Üç valentdən ibarət olan.

**ÜÇVERSTLİK** *sif.* 1. Üç verst uzunluğunda olan. *Üçverstlik yol. Üçverstlik məsafə.*

2\. *coğr.* Üç verst miqyaslı. *Üçverstlik xəritə.*

**ÜÇYARPAQ** *sif. bot.* Rütubətli yerlərdə və axar suların kənarlarında bitən ot bitkisi.

**ÜÇYAŞAR** b a x **üçillik** 2-ci mənada. *Üçyaşar heyvan. – Onun altında üçyaşar ürkə idi, mənimkində Tağı əminin boz madyanı.* S.S.Axundov.

**ÜÇYAŞLI** *sif.* Üç yaşı olan. *Üç-yaşlı qız. Üçyaşlı uşaq.*

**ÜÇYERLİ** *sif.* Üçadamlıq yeri olan. *Üçyerli loja.*

**ÜÇYÜZİLLİK** b a x **üçəsrlik**. *Üçyüzillik tarixi olan qala.*

**ÜÇZİRVƏLİ** *sif.* Üç zirvəsi (təpəsi, ucu) olan. *Üçzirvəli dağ.*

**ÜDÜLƏMƏ** "Üdüləmək"dən *f.is.*

**ÜDÜLƏMƏK** *f. dan.* Boş-boş danışmaq, çərənləmək, naqqallıq eləmək. ☐ **Üdüləyib-tökmək** – b a x **üdüləmək**.

**ÜFLƏMƏ** "Üfləmək"dən *f.is.*

**ÜFLƏMƏK** b a x **üfürmək**. *Gülsüm xala uşağın ağzını əli ilə örtüb, üzündən üflədi.* Ə.Haqverdiyev. *Xəlil acı-acı gülümsədi, papirosunun göyümtül, qatı tüstüsünü küləyə üflədi.* M.Hüseyn.

**ÜFUNƏT** *is.* Pis iy, pis qoxu. *Nə küçələrdə üfunət, nə döngələrdə zibil var.* Ə.Nəzmi. *Otağı iylənmiş dəri qoxusu kimi bir üfunət bürümüşdü.* İ.Hüseynov.

**ÜFUNƏTLƏNDİRMƏ** "Üfunətləndirmək"-dən *f.is.*

**ÜFUNƏTLƏNDİRMƏK** *f.* Üfunətlənməsinə, pis qoxu verməsinə səbəb olmaq; iyləndirmək. *Səliqəli maldarlar çöldən naxır qayıdan zaman oğul-uşağı düzərlər qapılara ki, camışlar, öküzlər, inək və danalar düz girsinlər tövlə həyətinə və bağ-bağçaya girib zibilləməsinlər və xarab etməsinlər və havanı üfunətləndirməsinlər.* C.Məmmədquluzadə.

**ÜFUNƏTLƏNMƏ** "Üfunətlənmək"dən *f.is.*

**ÜFUNƏTLƏNMƏK** *f.* Pis iy, pis qoxu vermək; iylənmək.

**ÜFUNƏTLİ** *sif.* Pis iy verən, pis qoxulu, üfunət yayan, pis iyli. [Həsən] *həyətdə paslı tənəkələr arası ilə keçib, üfunətli pilləkənə yanaşdı.* Çəmənzəminli. *Tahirzadə tozlu, üfunətli yerlərdən keçərək daş döşəməli yoxuş küçə ilə dikləndi.* Mir Cəlal.

**ÜFÜQ** *is.* [*ər.*] 1. Göyün yer və ya su səthi ilə bitişik kimi görünən xətti. *Ulduzlar tökülür dənizə bir-bir; Üfüqdə açılır səhərin gözü.* R.Rza. *Üfüqdə günün batması elə gözəl görünürdü ki, təsvir etmək mümkün deyildir.* M.Rzaquluzadə. // Göyün yerə doğru əyilmiş kimi görünən hissəsi. *Bulud üfüqü örtmüşdü. – O gün axşamüstü günəş üfüqə doğru əyilmiş, kölgələr uzanmağa başlamışdı.* S.Hüseyn. // Gözlə görünən göy sahəsi; ənginlik. *Təyyarə üfüqdə uçurdu.* // Obrazlı təşbehlərdə. *Bir fırtına müjdəsi var üfüqlərin gözündə; Qasırğalar rəqs etmədə göy dənizin*

*üzündə.* A.İldırım. *Açılır üfüqün nur sərhədləri; Səhər toranını göylər əridir.* M.Araz.

2\. *məc*. (adətən cəm şəklində). İmkan, fəaliyyət sahəsi. *Elmdə yeni üfüqlər açmaq.*

**ÜFÜQİ** *sif.* [*ər.*] Üfüq xəttinə paralel, şaquli xəttə perpendikulyar olan. *Üfüqi xətt. Üfüqi səth.*

**ÜFÜRMƏ** "Üfürmək"dən *f.is.*

**ÜFÜRMƏK** *f.* Dodaqlarını büzərək ağızdakı havanı şiddətlə bir şeyə yönəltmək. // Bu işi yanmaqda olan bir şeyi söndürmək və ya qızışdırmaq, ya da qızğın şeyi soyutmaq üçün etmək. *Şamı üfürüb söndürmək. Çayı üfürüb soyutmaq. – Gülsənəm arvad aşağı əyilib ocağı üfürməyə başladı.* M.Hüseyn.

**ÜQAB** *is.* [*ər.*] *köhn.* Qaraquş, qartal. *Çığırma, yat, ay ac toyuq, yuxunda çoxca darı gör! Sus, ay yazıq, fəzadəki üqabi-canşikarı gör!* M.Ə.Sabir.

**ÜQƏLA** *is.* [*ər.*] *köhn.* Ağıllı adamlar. *Hər nə görsən, görəcəksən üqəla və füzəla; Hamı təsdiq edəcək, hər nə buyursa üləma.* Ə.Vahid.

**ÜLƏMA** *is.* [*ər.* "alim" söz. cəmi] Alimlər. *Üləmalar üz döndərib xudadan.* Q.Zakir. *Şəhərin böyük üləma və dərvişləri* [Nəsiminin] *ziyarətinə getməyə başladılar*. Çəmənzəminli.

**ÜLFƏT** *is.* [*ər.*] 1. Qarşılıqlı, xoş, mehriban münasibət, yaxınlıq, əlaqə, ünsiyyət, dostluq. [Nadir bəy:] *İnsanlar arasında ülfət ziyadələşdikcə, şübhəsiz, könüldəki təəssürat və məhəbbət də o nisbətdə artmağa başlar*. H.Cavid. □ **Ülfət etmək (bağlamaq)** – bir-biri ilə əlaqəsi olmaq, yaxınlıq etmək, əlaqə yaratmaq, ünsiyyətdə olmaq. *İnsan insan ilə həmişə ülfət bağlamağa mayildir, necə ki heyvan ilə.* C.Məmmədquluzadə. // Görüşmə, qaynayıb-qarışma.

2\. Sevgi, məhəbbət. *Bağrıma basıram ana Vətəni; Bu ülfət ilhama çağırır məni!* S.Vurğun.

**ÜLGÜ** *is.* 1. Paltar və ya ayaqqabı hissələrini biçmək üçün nümunə; ölçü-biçi, əndazə. *Paltar ülgüsü.* // Nümunə model. *Pəncərə qabağında bir buruq ülgüsü var.* R.Rza.

2\. *məc*. Ölçü, ölçü vahidi, meyar. *Mən qadın xarakteri üçün bir ülgü qəbul etməkdə yanıldığımı gördüm*. M.S.Ordubadi. *Zaman qapımızda əlində qayçı... Hər adi ölçüyə, ülgüyə gəlsək; Sən kimə gərəksən; Mən kimə gərək?!* M.Araz.

**ÜLGÜC** *is.* 1. Tük qırxmaq üçün iti bıçaq. *Dəllək kisəbəndindən enli ülgücünü çıxarıb qırxırdı*. Çəmənzəminli. [Almurad] *ülgüclə qırxılmış başının tərini sildi.* İ.Əfəndiyev.

2\. *xüs*. Müxtəlif alətlərin kəsici tərəfi, bıçağı. *Ülgücün şaquli bıçağı cərgəyə tərəf 5-8° meyilli olmalıdır.* "Pambıqçılıq".

**ÜLGÜCLƏMƏ** "Ülgücləmək"dən *f.is.*

**ÜLGÜCLƏMƏK** *f.* 1. Ülgüclə qırxmaq. *Üzünü ülgücləmək.*

2\. *köhn*. Ülgüclə çərtmək, ülgüclə qan almaq. *Dalını ülgücləmək.*

**ÜLGÜÇÜ** *is.* Ülgü tutan, model düzəldən; modelçi.

**ÜLKƏR** *is.* Dana bürcündə yeddi ulduz topasının adı; Süreyya. // Ümumiyyətlə ulduz. *Karvan-karvan göydən ulduzlar köçür; Öz bəxtinə hər kəs bir ülkər seçir.* S.Vurğun. *Kim deyir ulduzun göydə sanı var? Hər yanan ülkərin öz dövranı var.* M.Rahim.

**ÜLUM** *is.* [*ər.* "elm" söz. cəmi] *klas*. Elmlər. *O əsrə nisbət hələ ülumun və sənayenin ziyadə tərəqqisi yox idi.* M.F.Axundzadə. *Və bir də bu məktəblilər bilümum; Oxurlar kamalınca ali ülum*. M.Ə.Sabir.

**ÜLÜŞ** *is. məh.* Arasına halva qoyulmuş yuxa, lavaş.

**ÜLVİ** *sif.* [*ər.*] 1. *tənt.* Yüksək, ali, uca, müqəddəs. *Ülvi amal.* – [Nizami:] *Sən bilirsən, anacan, dünyada ən yüksək, əm ülvi şey nədir?* M.Hüseyn. *Kişi söylədi ki:* "*Yüksəkdir ana; Ondan ülvi varlıq varmı dünyada?*" N.Xəzri.

2\. *klas*. Qeyri-maddi, mənəvi. *Ülvi eşq.*

**ÜLVİLİK** b a x **ülviyyət**. *Qulam müəllim yaşaran çocuq gözlərini təsəvvürünə gətirir, burada bir ülvilik və qüdsilik görürdü.* S.Rəhimov.

**ÜLVİYYƏT** *is.* [*ər.*] *tənt*. Yüksəklik, alilik, ucalıq, ülvilik, müqəddəslik. *Məcnunluq gözəldir!* "*Bu nədir?*" *– deyə; Hər cahil anlamaz bu ülviyyəti; Yazıq o kəsə ki, yoxdur bir şeyə; Nə sonsuz nifrəti, nə məhəbbəti!* B.Vahabzadə. // *məc. tənt.* Səma, göy. *Kölgəyə aldanaraq sevmə cəfa aləmini; Yüksəl ülviyyətə, seyr eylə səfa aləmini.* A.Səhhət.

**ÜMDƏ** *sif.* [*ər.*] Ən əsas, ən mühüm, başlıca, birinci. *Ümdə məsələ. Ümdə vəzifə.* – [Nuxulular:] *Əvvələn, o cənabın ziyarəti ümdə mətləbdir.* M.F.Axundzadə. *Güllü xanım söhbətin .. ümdə mahiyyətini anlayan kimi ayağa qalxdı*. B.Bayramov.

**ÜMƏRA** *is.* [*ər.* "əmir" söz. cəmi] *klas.* Əmirlər, hakimlər. *Sən dur ayaq üstə, demə bir söz ümərayə; Caiz deyil insanca danışmaq füqərayə.* M.Ə.Sabir.

**ÜMİD** *is.* 1. Arzu edilən bir şeyin ola biləcəyinə inanma və bu inamdan doğan daxili fərəh, xatircəmlik hissi; güman. *Ümidim bircə ona idi ki, Qoçaq mənim gəlmədiyimi görüb, özü mənim köməyimə yetişər*. M.Rzaquluzadə.

2. *məc.* Ümid ediləcək adam. [Qönçə Ataşa:] *Mənim ümidim, nicatım təkcə sənsən*. Ə.Vəliyev.

3. Çarə.

◊ **Ümid bağlamaq (bəsləmək)** – yaxşı bir şeyin olacağına inanmaq, birinə arxayın olmaq. [Şahmar:] *Mən döşünə döyənlərdən deyiləm, Nərminə, ancaq gələcəyə ümid bağlamaq özü də pis deyil*. B.Bayramov. *Ana kiçiyinə ümid bağladı; Dərdini gizlətdi, gecə ağladı; O, bircə arzuya, bircə niyyətə; Verdi ürəyini, verdi büsbütün*. B.Vahabzadə. **Ümid etmək** – bir şeyə ümidi olmaq, gözləmək, güman etmək. [Gülqönçə] *ümid edirdi ki, həkim ona kömək eləyər, onun səadətini qaytarar*. H.Seyidbəyli. **Ümid vermək** – 1) arzusunun, istəyinin həyata keçəcəyinə inandırmağa, arxayın etməyə çalışmaq. [Yüzbaşı] .. *gəlib Məmməd bəyin dəstəsinə qoşuldu, lakin yenə ümid verərək onu ovundurdu.* Çəmənzəminli; 2) arzu edilən, gözlənilən bir şeyin gələcəkdə olacağına inam vermək, arxayın etmək. *Gəncliyin bəzəkli və dolğun çağı; Bizə ümid verir, bizə can verir.* S.Vurğun. **Ümidi boşa (puça) çıxmaq** – arzusu, istəyi, gözlədiyi həyata keçməmək. *Bu kənddən qaçaqlar barəsində xəbər almaq xüsusundakı ümidlərim də boşa çıxdı*. H.Nəzərli. *Gələn adam ümidi puça çıxmış adamlar kimi əllərini yanına saldı*. Q.İlkin. **Ümidi qalmaq** – bir şeyin olacağına ümidi kəsilməmək, əl üzməmək. ...**ümidinə qoymaq** – bir şeyi birisinə inanaraq tapşırmaq, qızmaq. *Sadıq dəmiryolçunun girib-çıxmasından duydu ki, kişi mənzili onların ümidinə qoyub gedə bilmir.* Mir Cəlal. **Ümidini itirmək** – daha inanmamaq, əlini üzmək. [Almaz:] [Fuad] *da belə bir şeyə inansaydı, dünyada bütün ümidimi itirmiş olardım*. C.Cabbarlı. **Ümidini kəsmək (üzmək)** – arzusunun, istəyinin həyata keçəcəyinə daha inanmamaq, əlini üzmək. *Kəsmə ümidi vəsldən əyyami-hicrdə; Ey dil, bu şam kim gedər, axır səhər gələr*. S.Ə.Şirvani. *Dörd bir yanımı duman elə bürümüş ki, bir addım qabaq görünmür. O gün evə dönməkdən ümidimi üzdüm*. A.Şaiq. [Ana] *ümidini üzmədi, oğlunu gözlədi*. Ə.Məmmədxanlı.

**ÜMİDGAH** *is. klas.* Ümid bağlanılan yer və ya adam. *Vüsalə rəğbətim artır çəkəndə hicr qəmin; Xilasi-yol dilərəm öz ümidgahimdən.* Ə.Vahid.

**ÜMİDLƏNDİRMƏ** "Ümidləndirmək"dən *f.is.*

**ÜMİDLƏNDİRMƏK** *f.* Ümidvar etmək, ümid vermək, arxayın etmək.

**ÜMİDLƏNMƏ** "Ümidlənmək"dən *f.is.*

**ÜMİDLƏNMƏK** *f.* Ümidvar olmaq, ümid bəsləmək, ümid etmək, arxayın olmaq.

**ÜMİDLİ** *sif.* 1. Bir işin yaxşı qurtaracağına ümid verən; ümidverici. *Ümidli məsləhət.* – [Qəhrəman] *o gözlərdə, o dodaqlarda silinməz, ümidli və səmimi bir təbəssüm duyurdu.* H.Nəzərli.

2. Ümid edilə bilən, inanılan, etibarlı. *Yatmışdı sağ qolda Nəbi səngərə; Tutmuşdu özünə ümidli bərə*. H.K.Sanılı.

**ÜMİDSİZ** *sif.* və *zərf* 1. Heç bir ümid verməyən, ümid edilməyən, arxayın etməyən. *Ümidsiz cavab.*

2. Ümidini kəsmiş, məyus, naümid. *Qulu bu dəfə ümidsiz və könülsüz gəldi*. A.Şaiq. *Teymur isə o qədər də ümidsiz deyildi*. M.Hüseyn. // Sağalmasına, xilas olmasına, qurtarmasına ümid olmayan, çarəsiz (ağır xəstə haqqında). *Qüdrət ümidsiz ağır yataqdan qalxmışdı.* Mir Cəlal.

**ÜMİDSİZCƏ(SİNƏ)** *zərf* Ümidsiz halda, ümidini itirmiş halda, ümidsizliklə. *Ümidsizcə cavab vermək. – Bu xain və rəhmsiz zərbə ümidsizcəsinə qayalar arxasında can çəkişən bir ağ süvarinin idi.* H.Nəzərli. // Çarəsizcə(sinə).

**ÜMİDSİZLİK** *is.* Heç bir ümid olmadığı hal; naümidlik. [Kamran:] *O çöhrələrdə, o gözlərdə ümidsizlikdən bir əsər varmı?* H.Nəzərli. [Zeynəb] *ümidsizliyin ağır yollarını keçib dolanmış olduğundan o yollardakı vahiməli qaranlığa bələd idi*. M.İbrahimov. // Çarəsizlik.

**ÜMİDVAR** *sif.* 1. Ümidli, ümid edən. ◻ **Ümidvar etmək** – b a x **ümidləndirmək**. **Ümidvar olmaq** – 1) ümid etmək, arxayın olmaq. [Molla Xəlil] *belə bir mübarizədən qalib çıxacağına ümidvar olsaydı, müəllimlə rəftarı tamamilə başqa tərzdə olardı.* S.Hüseyn. [Nəbi:] *Ölsəm də, oluram buna ümidvar; Analar minlərcə Nəbilər doğar*. S.Rüstəm; 2) etibar etmək, qızmaq, inanmaq, xatircəm olmaq. [Qədir] *ailəsini yalnız Nəsirə ümidvar olub gedə bilərdi*. S.Hüseyn.

2. **Ümidvaram** şəklində – xatircəməm, inanıram. *Məcnun dedi: – Mən fədayi-yarəm; Vəslinə onun ümidvarəm.* Füzuli. [Elçin:] *..Ümidvaram ki, Sevinc çox gözəl usta olacaqdır*. Z.Xəlil.

**ÜMİDVERƏN, ÜMİDVERİCİ** *sif.* 1. Bəslənilən ümidi doğruldacaq, gələcəkdə kamil bir insan olacağına ümid bəslənilən, gələcəyi olan. [Gənc yazıçılar arasında] *istedadlı və ümidverici gənclər vardır*. Qəzetlərdən.

2. Ümid ifadə edən, ümidli. *Ümidverici vəziyyət. – Rüstəm kişi fikrini ümidverici sözlərlə qurtardı.* M.İbrahimov. *Lakin içəridən çıxanların heç birisinin sifətində ümidverici bir əlamət görünmürdü*. B.Bayramov.

**ÜMMAN** *is.* [*ər.*] 1. Böyük dəniz, dərya, okean. *Bir firtına quşu olub; Baş vurmuşam ümmanlara; Dənizdə dürr axtarmışam.* R.Rza. *Cüt axıb tökülür çaylar ümmana; Uca-uca dağlar lap baş-başadır*. N.Rəfibəyli. // Şairanə təşbehlərdə. *Xoş olar ürəyin ümmanı varsa; Sevinci, şadlığı duyanı varsa*. N.Xəzri.

2. *məc*. Hədsiz, həddən artıq, sonsuz, çox. *Ümman dərdim var mənim; Könlüm olur xar mənim; Məskənim dağlar başı; Həmdəmimdir qar mənim*. (Bayatı).

**ÜMMƏT** *is.* [*ər.*] 1. Xalq, camaat. *Açdın gözünü rəncü məşəqqət görəcəksən; Millətdə qəm, ümmətdə küdurət görəcəksən.* M.Ə.Sabir.

2. *din.* Bir peyğəmbərə inanan adamlar, xalq, camaat. [Fərrux Molla Qurbana:] *Məhəmməd ümmətinin bu dünyaya uymayıb, o dünya üçün yaşamasından söz aç.* Ə.Vəliyev.

**ÜMUM** *is.* [*ər.*] Hamı, hamısı. *Ümuma aid məsələ*. – [Anisimin] *ixtirası keçmiş, ümumun təqdirini qazanmışdı*. S.Rəhimov.

**ÜMUMBƏŞƏRİ** *sif.* [*ər.*] Bütün adamlara, bütün bəşəriyyətə xas olan, aid olan, bütün insanlar üçün əhəmiyyəti olan. *Ümumbəşəri mövzu. – Əsil, həqiqi, böyük poeziya isə ümumbəşəri yaddaşdır*. Y.Qarayev.

**ÜMUMDÜNYA** *is.* [*ər.*] Bütün dünyaya, dünyanın bütün ölkələrinə aid. *Ümumdünya əhəmiyyətli kəşf. Ümumdünya konqresi. Ümumdünya Sülh Tərəfdarları Şurası*.

**ÜMUMƏN** *zərf* [*ər.*] Ümumiyyətlə, ümum, hamı. *Sürməkdə idi şiddət ilə hökmünü zülmət; Qalmışdı qaranlıqda ümumən bəşəriyyət*. Ə.Nəzmi. *Ümumən Müqim bəy arvadından çəkindiyini daima ustalıqla malalamağa çalışırdı*. S.Rəhimov.

**ÜMUMXALQ** *is.* [*ər.*] Bütün xalq üçün ümumi, bütün xalqa aid. *Ümumxalq mülkiyyəti. Ümumxalq bayramı*.

**ÜMUMİ** *sif.* [*ər.*] 1. Ümuma, hamıya aid olan; hər şeyi, hamını əhatə edən, qavrayan. *Ümumi seçki hüququ. Ümumi tərk-silah*. // Hamıya, hər şeyə şamil olan, xas olan. *Ümumi nöqsanlar. Ümumi qaydalar. Ümumi vəziyyət.*

2. Hamıya və ya bir neçəsinə məxsus, birgə istifadə olunan; müştərək. *Ümumi əmlak. Ümumi koridor. – Üç gün sonra qayınanaya ayrıca bir otaq təxsis olundu, ümumi yoldan belə məhrum edildi*. Çəmənzəminli. ◻ **Ümumi yataqxana** – adətən bir müəssisədə işləyən və ya bir məktəbdə oxuyan adamların bir yerdə yaşaması üçün ev. *Ümumi yataqxanada işıqlar sönmüşdü*. H.Seyidbəyli.

3. Başqası ilə eyni, uyğun olan, bənzər, başqası (başqaları) ilə eyni zamanda olan. *Ümumi mənafe. Onların arasında ümumi cəhətlər çoxdur.*

4. Birgə, birlikdə götürülmüş; bütün, tamam, ümumən, cəm. *İşçilərin ümumi sayı. Ümumi nəticə.*

5. Bir şeyin əsaslarına aid olan. *Elmin ümumi məsələləri. Ümumi anatomiya.*

6. Təfərrüatına, təfsilatına varmadan, əsasən başlıca xüsusiyyətləri qavrayan. *Ümumi*

*təəssürat. Vəziyyəti ümumi şəkildə təsvir etmək. Ekspedisiyanın ümumi planı.*

◊ **Ümumi dil tapmaq** – qarşılıqlı anlaşmaya nail olmaq, bir-biri ilə razılaşmaq, razılığa gəlmək. [Ömər Lütfi:] *Onlar ilə ümumi bir dil tapmaq mümkündür.* H.Nəzərli. **Ümumi iclas (yığıncaq)** – hər hansı kollektivə, təşkilata, idarəyə mənsub adamların hamısının iştirak etdiyi iclas (yığıncaq). *Məktəbin ümumi iclası.* **Ümumi təhsil** – xüsusi ixtisas vermədən, hərtərəfli hazırlıq verən təhsil.

**ÜMUMİLƏŞDİRİLMƏ** "Ümumiləşdirilmək"dən *f.is.*

**ÜMUMİLƏŞDİRİLMƏK** "Ümumiləşdirmək"dən *məch. Həyatdan, taledən şikayət, narazılıq, giley-güzar, etibarsızlıq kimi cəhətlər bayatılarda elə ümumiləşdirilmişdir ki, onun hər bir misrasında .. xalqın ürək çırpıntıları duyulmaqdadır...* İ.Abbaslı.

**ÜMUMİLƏŞDİRMƏ** 1. "Ümumiləşdirmək"dən *f.is.*

2. Ayrı-ayrı faktları, hadisələri müşahidə və öyrənmək nəticəsində hasil olan ümumi fikir, mülahizə; ümumi nəticə. *Əsərdə irəli sürülən ümumiləşdirmələr.*

**ÜMUMİLƏŞDİRMƏK** *f.* 1. Bir yerdə birləşdirmək, vahid bir küll halında birləşdirmək. [Firəngiz Muxtara:] *Mənə elə gəlir ki, yazıçı hekayəsində xalqımızın müdrik fəlsəfəsini ümumiləşdirmişdir.* B.Bayramov.

2. Bir sıra hadisə, ya faktı tutuşdurma yolu ilə onların hamısına eyni dərəcədə xas olan xüsusiyyətləri aşkara çıxarmaq, onları bir küll, bir qrup halında birləşdirmək. // Ayrı-ayrı faktların nəzərdən keçirilməsi əsasında ümumi nəticələr çıxarmaq. *İstehsalat qabaqcıllarının təcrübəsini ümumiləşdirmək.*

**ÜMUMİLƏŞMƏK** *f.* 1. Bir yerdə, bir ümumi şeydə birləşmək.

2. Ümumi olmaq, eyni dərəcədə hamıya, bütün cəmiyyətə məxsus olmaq; ictimailəşmək.

**ÜMUMİLİK** *is.* 1. Ümuma, hamıya və ya çoxusuna aid olma; ümumiyyət.

2. Birlik, ayrılmazlıq, uyğunluq. *Nöqteyinəzərlərin ümumiliyi. Məqsəd ümumiliyi. Dil ümumiliyi.*

**ÜMUMİYYƏT** [*ər.*] b a x **ümumilik** 1-ci mənada. [Xamburabi:] *Çünki cəmiyyət ümumiyyət, fərd isə xüsusiyyət deməkdir.* Çəmənzəminli.

**ÜMUMİYYƏTCƏ** *dan.* b a x **ümumiyyətlə**. *Ümumiyyətcə, o, hazırlıqlı tələbədir.*

**ÜMUMİYYƏTLƏ** 1. Deyilənləri yekunlaşdırıcı, ümumiləşdirici ara söz kimi işlənir. *Ümumiyyətlə, "Molla Nəsrəddin" susmağı bacarmırdı, o, etiraz etmək üçün doğulmuşdu.* M.İbrahimov. *Ümumiyyətlə,* [Durna] *pis dolanmamışdı, ancaq indi oğlunun evindəki firavan həyatı heç vaxt görməmişdi.* Ə.Sadıq.

2. *zərf* Ayrılıqda deyil, ümumi surətdə götürdükdə; hamılıqla. [Nizami] *Fəxrəddinin qəhrəmanlığını və ümumiyyətlə azərbaycanlıların hərbi dəyərini çox gözəl bilirdi.* M.S.Ordubadi.

**ÜMUMQOŞUN** *is.* və *sif.* Bütün qoşun növləri üçün ümumi, vahid olan, bütün qoşun növlərini qavrayan. *Ümumqoşun taktikası. Ümumqoşun nizamnaməsi.*

**ÜMUMMİLLİ** *sif.* [*ər.*] Bütün millət üçün ümumi olan, bütün millətə aid olan. *Ümummilli dil. Ümummilli bayram.*

**ÜMUMRAYON** *is.* [*ər.* ümum və *fr.* rayon] Bütün rayon üçün ümumi, bütün rayona aid. *Ümumrayon iməciliyi.*

**ÜMUMRESPUBLİKA** *is.* [*ər.* ümum və *lat.* respublika] Bütün respublika üçün ümumi, bütün respublikaya aid. *Pambıq əkinlərinə ümumrespublika baxışı.*

**ÜMUMŞƏHƏR** *is.* [*ər.*] Bütün şəhər üçün ümumi, bütün şəhərə aid. *Ümumşəhər partiya konfransı. Ümumşəhər kitabxanası.*

**ÜMUMTƏHSİL** *sif.* [*ər.*] Xüsusi deyil, ümumi təhsil verən. *Ümumtəhsil məktəbləri.*

**ÜMUR** *is.* [*ər.* "əmr" söz. cəmi] *klas.* İş, vəzifə. [Yusif Sərrac] *naçar ümuri-səltənətin icrasına iqdam etdi.* M.F.Axundzadə.

**ÜN** *is. qəd.* Səs, səda. *Ünümdən titrədi tamam vilayət; Eylə sandılar ki, qopdu qiyamət.* M.P.Vaqif. *Kədərli keçirdi dustağın günü; Gecə musiqisi bayquşun ünü.* H.K.Sanılı.

**ÜNAS** *is.* [*ər.*] *klas.* Qadın, arvad. [Hacı Mehdi:] *Mən dünən hamamdan qayıdan vaxt bir ünas tayfasına rast gəldim.* Ə.Haqverdiyev.

**ÜNQA** *is.* [*ər.*] b a x **simurq**.

**ÜNLƏMƏK** *f.* Səsləmək, çağırmaq.

**ÜNS** *is.* [*ər.*] 1. *klas.* İnsan, bəşər, adam.

2. Bax **ünsiyyət**. ◻ **Üns bağlamaq (salmaq, tutmaq)** – bax **ünsiyyət bağlamaq (salmaq, tutmaq)** (“**ünsiyyət**”də). *Çün ol bəşəriyyəti unutdu; Ahu onunla üns tutdu.* Füzuli. *Oğlan Nəriman əmi ilə Qərənfil bacıya doğma ata-anası kimi üns salmışdır.* İ.Əfəndiyev.

**ÜNSİYYƏT** *is.* [*ər.*] 1. Qarşılıqlı münasibət, əlaqə, yaxınlıq, ülfət. *Hələ bir-birini tanımayan adamlar heç xəbərləri olmadan bir-birinə yaxınlaşır, onların arasında ülfət və ünsiyyət daha da möhkəmlənirdi.* Ə.Əbülhəsən. *Atla kişinin* [Mahmudalının] *arasında qəribə bir ünsiyyət əmələ gəlmişdi.* İ.Əfəndiyev. ◻ **Ünsiyyət bağlamaq (salmaq, tutmaq)** – aralarında yaxşı münasibət yaranmaq, bir-biri ilə yaxın olmaq, ülfət bağlamaq. *Biz sizə o qədər alışdıq, elə ünsiyyət bağladıq ki, ayrılmaq çətindir, – deyə, bir dost bizə müraciət edir.* M.İbrahimov.

2. Əlaqə, rabitə, qarşılıqlı münasibət. *Dil insanlar arasında ünsiyyət vasitəsidir.*

3. Xoş münasibət, yaxınlıq, mehribanlıq. *Ailədə ünsiyyət artıran, ürəkdə munis duyğular oyadan belə axşamlardan sonra yuxu nə qədər şirin olardı.* M.İbrahimov. *Həbib Gözəlin evində hərarət, körpələrində ünsiyyət, özündə mərhəmət gördüyü kimi, Gözəl də Həbibdə insaniyyət, mehribanlıq hiss edirdi.* Ə.Vəliyev.

**ÜNSİYYƏTLİ** *sif.* Adamlarla çox tez yaxşı münasibət yarada bilən; adamayovuşan, istiqanlı, mehriban. *Ünsiyyətli adam.*

**ÜNSİYYƏTSİZ** *sif.* Adamlarla münasibət yarada bilməyən; adamayovuşmaz, qanısoyuq. *Ünsiyyətsiz adam.*

**ÜNSÜR** *is.* [*ər.*] 1. Qədim materialist fəlsəfədə: təbiətin, bütün şeylərin, hadisələrin bünövrəsini təşkil edən əsas tərkib hissələrindən biri (od, su, hava, torpaq).

2. *kim.* Adi kimyəvi üsullarla tərkib hissələrinə ayrıla bilməyən, yaxud da sintez yolu ilə əldə edilə bilməyən bəsit maddə; element.

3. *məc.* Hər hansı ictimai təbəqənin nümayəndəsi. *Cəmiyyətin mütərəqqi ünsürləri.* – ..*Nəsir* [Qədirin] *istirahət və səadətini əlindən almağa .. çalışan müzür bir ünsürdür.* S.Hüseyn. [Rəbi:] *Düşmən ünsürlərdən də bir çoxunu yaxaladım.* C.Cabbarlı. // Şəxs, adam. *Qəbilənin çalışmaq iqtidarından məhrum bütün ünsürləri burada* [əlillər evində] *idi.* Çəmənzəminli.

4. Tamı əmələ gətirən hissələrdən, cüzlərdən hər biri. *Musiqi ifadəliliyinin bir çox mühüm ünsürləri* (*kök, vəzn, tembr və sairə*) *məhz melodiyanın tərkibində birləşərək bir vəhdət təşkil edir.* Ə.Bədəlbəyli. *İqlim ünsürlərindən biri də havanın nisbi rütubətidir.* “Çay bitkisi”. // *xüs.* Hər hansı qurğunun, mexanizmin hissəsi, detalı.

**ÜNVAN** *is.* [*ər.*] 1. Bax **adres** 1 və 2-ci mənalarda. [Maral] *çox sağ ol! – dedi və ünvanını verərək Qara kişini Bakıya, evinə qonaq çağırdı.* Ə.Əbülhəsən. *Ünvanlara baxa-baxa; Bir qapını döydü onlar.* M.Dilbazi.

2. **Ünvanına** şəklində – haqqında, barəsində, aid. *Ərlə arvad ünvanına qoşa sağlıqlar; Deyildikcə fikrə getdi qəm yeyə-yeyə.* S.Vurğun. [Qüdrət] *şəxsən öz ünvanına yağdırılan ittihamları rədd etməyə haqlı deyildi.* M.Hüseyn.

3. *klas.* **Ünvanında, ünvanlı** şəklində – adında, adlı, sərlövhəli, adı altında. *Bu aprelin 4-də .. elm və kamal təhsil edən müsəlman cavanları hökumət rüsxəti ilə mərhum* M.F.Axundzadənin “*Məstəli şah*” *ünvanında tərtib etdiyi komediyanı oynayıblar.* F.Köçərli.

**ÜNYETMƏZ** *sif.* Çox uzaq; çox uzaq olduğu üçün səs də gedib çatmayan; səs eşidilməz. *Get-gedə qatılaşan sükutdan Orxan bir az vahimələndi, özünü dünyanın əlçatmaz, ünyetməz guşəsinə atılmış kimi tək-tənha hiss elədi..* İ.Məlikzadə.

**ÜRCAH** *is. məh.:* **ürcah olmaq** – rast gəlmək, təsadüf etmək, rastlaşmaq. *Gorusun qarşısında bunlar bir bəynən strajnikə ürcah oldular.* “Qaçaq Nəbi”. [Şahpəri:] *Nəvən ürcah olacaqdı ədabazın, yelbeyinin birinə, o da sənin qədrini nə biləcəkdi!* B.Bayramov.

**ÜRƏFA** *is.* [*ər.* “arif” söz. cəmi] *klas. kit.* Ariflər, mərifətli, ağıllı adamlar. *Ürəfa məskəni olan Şirvan; Cühəla xabgahidir əlan.* M.Ə.Sabir.

**ÜRƏK** *is.* 1. İnsanda qan dövranının, döş boşluğunun sol tərəfində yerləşən əzələli kisə şəklində mərkəzi orqanı; qəlb. *Ürəyin döyünməsi. Ürək xəstəliyi.* // Döşün qol tərəfində

həmin orqanın üstündəki yer. *Ürəyini tutmaq. – Bibixanım əlini ürəyinin üstünə qoydu..* B.Bayramov.

2. *məc.* Həmin orqan insanın hiss, həyəcan, əhvali-ruhiyyə, təəssürat simvolu kimi. *Adamın ürəyi sevinir. Ürəyini həyəcanlandırmaq. Ürəyim sakit deyil.* – [Sultan bəy:] *Yaxşı, yaxşı, naz eləmə, bilirəm ki, ürəyində sevinirsən.* Ü.Hacıbəyov. *Ailədə ünsiyyət artıran, ürəkdə munis duyğular oyadan belə axşamlardan sonra yuxu nə qədər şirin olardı.* M.İbrahimov. // *məc.* Bu orqan həssaslıq, xeyirxahlıq simvolu kimi. *Ürəyi olmayan adamlar onu başa düşə bilməzlər.* // Həmin orqan məhəbbət, sevgi, eşq, vurğunluq, qəlbən bağlılıq kimi (bu mənada əsasən "qəlb" sözü işlənir).

3. *məc.* b a x **qəlb²** 2-ci mənada. [Fitnə:] *Bu, elin öz istəyidir; El dövlətin ürəyidir.* A.Şaiq.

4. *məc.* Cəsarət, hünər. *Gecə ikən bir qadının təkbaşına ormana getməsi böyük bir ürək və cəsarət istər.* S.Hüseyn.

5. **Ürəyindən** şəklində *zərf* – istədiyi kimi, arzusuna müvafiq olaraq, arzuladığı kimi. [Hacı Hüseyn İslamın] *lap ürəyindən danışmışdı.* S.Hüseyn.

6. **Ürəklə** şəklində *zərf* – 1) qorxmadan, çəkinmədən, ehtiyat etmədən, hünərlə, cəsarətlə. *Ürəklə vuruşmaq. – Şahmar ürəklə dilləndi.* B.Bayramov; 2) həvəslə, ürəkdən, can və könüldən. *Çox məclis qurmuşam ağ bulağında; Ürəklə danışıb gülmüşəm, dağlar!* Aşıq Şəmşir.

◊ **Ürək ağrısı (yanğısı) ilə** – b a x **ürəkağrısı**. *O – ürək yanğısı, göz yaşları, bir çəngə bulud; Oyadıb yaddaşı, vicdanı utandırdı muğam.* B.Vahabzadə. **Ürək bağlamaq** – qəlbini bağlamaq, qəlbən bağlanmaq. *Yoldaşına ürək bağlamaq.* **Ürək bulandırmaq** – nifrət hissi oyatmaq, iyrəndirmək. *Hələ şəhərlərdə nişanələr var; Ürək bulandıran əfsanələr var.* M.Müşfiq. **Ürək çırpıntısı ilə** – ürəyi çırpına-çırpına, intizarla, narahatlıqla. *Sözün yerinə düşdüyünə sevinən Tükəzban xala, ürək çırpıntısı ilə Muradovun cavabını gözlədi.* İ.Şıxlı. **Ürək dostu (yoldaşı)** – ən yaxın dost, yoldaş, sirdaş. *Dostun bir tək dostu ol; Arxa-dirək dostu ol; Dost deyib, dost olanda; Söz yox, ürək dostu ol.* (Bayatı). **Ürək eləmək** – bir işi görməyə cürət etmək, cəsarətlənmək, ürəklənmək. *Nə mən ürək edirəm, yazım ona bir kağız; Nə də mənə yazmayır o şən, o mehriban qız.* Ə.Cəmil. **Ürək eləməmək** – cəsarət eləməmək, ürəklənməmək. *O qədər adamdan heç kəs cınqırını çıxartmağa da ürək eləməsin?!* Ə.Əbülhəsən. **Ürək qızdırmaq** – inanmaq, etibar etmək, qızmaq. *Ona ürək qızdırmaq olmaz.* – [Rüstəm kişi] *Yarməmməd hadisəsindən sonra Salman və Lal Hüseynə ürək qızdıra bilmirdi.* M.İbrahimov. [Gövhər xanım:] *Tanımadığım, bilmədiyim adama necə ürək qızdırım?* İ.Hüseynov. **Ürək qoymamaq** – b a x **ürəyini yarmaq**. *Öpdülər Osmanı qaçaqlar təktək; Dedilər: – Qoymadın sən bizdə ürək!* H.K.Sanılı. **Ürək sındırmaq** – ürəyinə toxunmaq, qəlbinə toxunmaq, özündən incitmək. *Özgə qismətinə göz də dikmədim; Ürək sındırmadım, qəlb incitmədim.* B.Vahabzadə. **Ürək vermək** – 1) ürəkləndirmək, cəsarətləndirmək, bir işə ruhlandırmaq. *Arabir Nəbi yoldaşlarına ürək vermək üçün nərə çəkir.* "Qaçaq Nəbi". [Sərvinaz:] *Toyuq ölsə bir çəngə tükdür, dəvə ölsə dərisi bir yükdür, – deyə, öz-özünə ürək verdi.* B.Bayramov; 2) sevmək, məhəbbət yetirmək. [Rövşən:] *Xanım, mənim sevgilim vardır. Mən onunla əhd-peyman eləmişəm ki, bir özgəsinə ürək verməyəm.* (Nağıl). **Ürək yandırmaq** – b a x **can yandırmaq** ("**can**"da). *İşə ürək yandırmaq.* – [Kələntər Rüstəmə:] *Hərəsi bir dərədən gəlib. Muğana nə ürək yandıracaqlar..* M.İbrahimov. **Ürək yanğısı ilə** – b a x **ürək ağrısı ilə**. *Katib .. ürək yanğısı ilə davam etdi.* B.Bayramov. **Ürəkdən tikan çıxar(t)maq** – birinin qisasını başqasından almaq. **Ürəklərini boşaltmaq** – öz kədərlərini, həyəcanlarını, hisslərini bir-birinə danışmaq. **Ürəyə işləmək** – təsir etmək, təsirləndirmək. *Nənənin ürəyə işləyən sözlərinin müqabilində Cəmil də doluxsundu.* S.Rəhimov. **Ürəyi açılmaq** – qəmdən, kədərdən qurtarıb sevinməyə başlamaq, kefi açılmaq. [Sara Əbdülə:] *Zəhmət də olsa, lütf edib, məni pəncərənin qabağına aparın, bir az* [xanəndəyə] *qulaq asım, ürəyim açılsın.* C.Cabbarlı. [Tükəzban:] *O zamanlar adamın ürəyi açılmır, üzü gülmürdü.*

M.Hüseyn. **Ürəyi ağrımaq** *məc.* – yazığı gəlmək, rəhmi gəlmək; acımaq. **Ürəyi ağzına gəlmək** – 1) iyrənmək, çiyrənmək. [Qurban:] *Üzünə baxanda adamın ürəyi ağzına gəlir.* Ə.Haqverdiyev; 2) bərk qorxmaq, qorxu hissi keçirmək. **Ürəyi aşıb-daşmaq** – çox sevinmək, şadlanmaq, fərəhlənmək. *Ürəyim fərəhdən aşıb-daşanda; Qışı yaz görürəm, qaranı ağ mən.* B.Vahabzadə. **Ürəyi atlanmaq** – 1) həsrətində olmaq. *O yerləri görmək, Çinarlı bulaqdan su içmək üçün Yusifin ürəyi atlanırdı.* B.Bayramov; 2) b a x **ürəyi döyünmək**. [Sabirin] *dərs zamanı həmişə ürəyi atlanırdı.* S.Rəhimov. **Ürəyi atmaq** – b a x **ürəyi atlanmaq** 1-ci mənada. **Ürəyi ayağının altına düşmək** – b a x **ürəyi qopmaq**. **Ürəyi bir tikə olmaq** – b a x **ürəyi ərimək**. *Burada bəzilərinin ürəyi bir tikə olur.* Mir Cəlal. **Ürəyi birtəhər olmaq** – özünü pis hiss etmək, ürəyi üzülmək. [Sevil Atakişiyə:] *Bəsdir, ay əmi, ürəyim birtəhər oldu.* C.Cabbarlı. **Ürəyi boşalmaq** – sakitləşmək, ağlayıb rahat olmaq. *..Şəfiqə isə evdə tək qalıb ürəyi boşalana kimi ağladı.* İ.Musabəyov. **Ürəyi böyümək** – iftixar, məmnunluq hissi ilə fərəhlənmək, sevinmək. *Səhərki sovqat şeylərinin hazırlanmasını fikirləşdikcə Qərənfil xalanın ürəyi böyüyür, şadlığından otağa sığmırdı.* Ə.Vəliyev. **Ürəyi bulanmaq** – 1) qusmaq ehtiyacı hiss etmək, mədəsi qarışmaq. [Səfərqulu bəy:] *..Şoqəribin adını çəkəndə ürəyim bulanır.* S.S.Axundov. [Əlləzoğlu:] [Gülgəzin] *yenə ürəyi bulanır, başı da ağrıyır.* İ.Hüseynov; 2) nifrət hiss etmək, nifrətlənmək. *Əbil gördüklərini, eşitdiklərini qeyd eləyir, dostlarını görəndə ürəyi bulanır, qan beyninə sıçrayırdı.* Ə.Vəliyev. **Ürəyi buz kimi olmaq** – tamamilə sakit, rahat, xatircəm olmaq. **Ürəyi cızıldamaq (cız-cız cızıldamaq)** – b a x **ürəyi yanmaq** 2-ci mənada. **Ürəyi çatlamaq** – ürəyi partlamaq. *Çatlayır, Xanbacı, qəmdən ürəyim; Qovuşub lap acığımdan kürəyim.* M.Ə.Sabir. **Ürəyi çəkilmək** – son dərəcə üzülmək, zəifləmək, canı qalmamaq. *Hacı Atakişi köksünü ötürdü: – Yox, Əli Sadiqi, elə demə, ürəyim çəkilib, quru bədənim qalıb.* Ə.Abasov. **Ürəyi çəkməmək** – b a x **ürəyi götürməmək**. **Ürəyi çırpınmaq** – narahat olmaq, həyəcanlanmaq. *Səltənətin ürəyi çırpındı.* B.Bayramov. **Ürəyi dabanına düşmək** – b a x **ürəyi ayağının altına düşmək**. **Ürəyi dağ boyda olmaq (dağa dönmək)** – fəxr etmək, iftixar etmək, hədsiz sevinmək. *Sözlərini dalğa-dalğa yaydı səhər küləyi; Dağa döndü anaların, ataların ürəyi.* S.Vurğun. [İlyas Adiləyə:] *Dayımla bərabər yanaşı at sürərək kənddən çıxanda ürəyim dağa dönmüşdü.* Ə.Məmmədxanlı. **Ürəyi dağ-dağaya düşmək** – bərk həyəcan keçirmək, narahat olmaq, səksəkəli olmaq. *Qız ha gözlədi ki, indi İbrahim gələr, bu saat İbrahim gələr, gördü yox, İbrahim, deyəsən, heç burda yoxmuş. Axırda ürəyi dağ-dağaya düşdü.* (Nağıl). **Ürəyi dağlanmaq** – son dərəcə qəmlənmək, kədərlənmək. *Bu zaman Lətif şahın ürəyi dağlanıb, sazı basdı sinəsinə.* "Lətif şah". **Ürəyi darıxmaq** – b a x **ürəyi sıxılmaq**. *Əşrəfin ürəyi darıxdı.* S.Rəhman. **Ürəyi daşa dönmək** – zalımlaşmaq, qəddarlaşmaq, amansızlaşmaq, riqqət hissini itirmək. [Əbdül:] *Adamların ürəyi daşa dönüb.* C.Cabbarlı. *Göz qızanda qulaq kar olur, ağıl başdan çıxır, ürək daşa dönür, dil lal olur.* Ə.Abasov. **Ürəyi daşdan (dəmirdən)** – zalım, rəhmsiz, heç kəsə yazığı, rəhmi gəlməyən, acımayan adam haqqında. *Ürəyi daş olan bir filankəsə; İndi necə qıyım öz ürəyimi?* B.Vahabzadə. **Ürəyi dilində** – sadədil, ürəyiaçıq adam haqqında. *Qasım Kəngərli təbiətən sadə, təmiz adam idi, "siyasət" bilməzdi, ürəyi dilində idi.* M.İbrahimov. **Ürəyi dolu** – kədərdən və ya sevincdən ürəyində çoxlu deməli, yaxud yazmalı sözü olan adam haqqında. *Məstan bəyin ürəyi dolu idi. Boşaltmağa adam axtarırdı.* B.Talıblı. *Ürəyim doludur, qoy deyim bir-bir; Boldur çörəyimiz, boldur çayımız.* H.Hüseynzadə. **Ürəyi düşmək** – bərk qorxmaq, vahimələnmək. [Odabaşı:] *Mücrünü gördükcə Fərmanın bir qədər ürəyi düşdü.* Ə.Haqverdiyev. [Xanımnaz:] *Salıblar* [Almazı] *dilə-ağıza. Hələ iki adam yığışanda ürəyim düşür.* C.Cabbarlı. **Ürəyi ərimək** – kədərdən, qorxudan üzülmək. *Neyləyim kim, bən fəqirəm, sən əmir; Həsrətindən yürəyim hərdəm ərir.* Nəsimi. **Ürəyi əsmək** – 1) iztirab keçirmək, qorxudan əsmək. [Xanımnaz Almaza:] *Ay qızım, qurban olum*

*sənə, ürəyim əsirdi*. C.Cabbarlı. [Səlim bəy:] *Bax, yenə əlimdə əsirsən, əsir; Duyuram, qorxudan ürəyin əsir.* S.Rüstəm; 2) birinin həsrətində olmaq, arzulamaq. *Gülşadın anasından ötrü ürəyi əsirdi, burnunun ucu göynəyirdi.* Ə.Vəliyev. **Ürəyi getmək** – 1) huşunu itirmək, bayılmaq. *Bu yerədəymənin zərbindən zavallı uşağın ürəyi getdi.* S.S.Axundov. [Əbdül Gülnisəyə:] *Xanım, Saranın ürəyi gedib, tez həkim lazımdır!* C.Cabbarlı; 2) bərk acmaq, yemək istəmək. [Maya:] *Gedək, Pərşan, mən özüm də qayğanaqdan-zaddan bişirə bilirəm, yaman da acmışam, yəqin ki, Qaraşın da ürəyi gedir*. M.İbrahimov; 3) bir şeyin bərk həsrətində olmaq, arzusunda olmaq, istəmək. [Təlxək əcinnə:] *Səndən ötrü ürəyim gedir.* Ə.Haqverdiyev. **Ürəyi gəlməmək** – 1) qıymamaq, əli getməmək, heyfi gəlmək. *Süräyya sonsuz bir fərəhlə bu açılan qönçələrin üzərinə yüyürür, onları qoparmağa ürəyi gəlmir, yalnız əllərinin şəfqətli təmasilə bir-bir onları oxşamaq istəyirdi*. Ə.Məmmədxanlı. *Əsmər xala gözlərini stolun kənarında qüssəli oturmuş adamdan çəkdi, ancaq bu sözləri deməyə ürəyi gəlmədi*. Q.İlkin; 2) qorxmaq, ehtiyat etmək, çəkinmək. *Əcəb xala kəndin aşağı başında olduğu üçün təkbaşına gecə vaxtı getməyə ürəyi gəlmədi.* S.Hüseyn. **Ürəyi götürməmək** – təbiəti qəbul etməmək, çəkməmək. *Həkimin yazdığı dərmanı anama çətinliklə içirdirdim, ürəyi götürmürdü*. Mir Cəlal. **Ürəyi gup (gurp, tıp) eləmək** – b a x **ürəyi düşmək**. **Ürəyi gülmək** – şadlanmaq, fərəhlənmək, sevinmək. **Ürəyi xarab olmaq** – 1) b a x **ürəyi getmək**. *Mehribanın ürəyi xarab olub özündən getmişdi*. S.Hüseyn; 2) bərk kədərlənmək, təsirlənmək. *Qız özünü saxlaya bilməyib ağladı. Ata-anasının ürəyi xarab olub dedilər.* (Nağıl). **Ürəyi içinə düşmək** – b a x **ürəyi düşmək**. **Ürəyi istədiyi kimi** – necə istəyir, necə lazımsa. **Ürəyi istədiyi qədər** – nə qədər istəyir, nə qədər lazımsa o qədər. **Ürəyi istəyən** – hər nə istəyir, hər nə lazımdır, hər nə arzulayır. *Novruz bayramına iki gün varıydı... Küsülülər barışırdı, ürəyi istəyənlər bir-birini qonaq çağırırdı...* "Aşıq Ələsgər". **Ürəyi keçmək** – b a x **ürəyi getmək** 1-ci mənada. *Güllənin səsinə padşahın ürəyi keçib yerə yıxıldı.* (Nağıl). **Ürəyi köksünə sığmamaq** – hədsiz dərəcədə fərəhlənmək, iftixar etmək, sevinmək. **Ürəyi kövrəlmək (kövrəklənmək, kövrəkləşmək)** – doluxsunmaq, təsirlənmək, riqqətə gəlmək. *Kərəm bunları görəndə ürəyi kövrəldi*. "Əsli və Kərəm". **Ürəyi qalxmaq** – 1) b a x **ürəyi bulanmaq** 1-ci mənada. [Şamoya] *elə gəldi ki, onun quluncu bərk sancır, kürəyi qovuşur, ürəyi qalxır.* S.Rəhimov; 2) b a x **ürəyi atlanmaq** 1-ci mənada. **Ürəyi qan olmaq (qana dönmək)** – son dərəcə kədərlənmək. *Kərəmin ürəyi qana döndü, elə bildi ki, bu, Əslinin ceyranıdır*. "Əsli və Kərəm". *Harda qaldın, sənə qurban, ürəyim qan oldu?* M.Möcüz. **Ürəyi qanla dolmaq** – b a x **ürəyi qan olmaq (qana dönmək)**. **Ürəyi qəfəsə salınmış quş kimi çırpınmaq** – b a x **ürəyi quş kimi çırpınmaq**. **Ürəyi qıldan (sapdan, tükdən) asılı olmaq (asılmaq)** – ürəyi xəstə, zəif adam haqqında. **Ürəyi qırılıb ayağının (ayaqlarının) altına düşmək** – b a x **ürəyi ayağının altına düşmək**. **Ürəyi qısılmaq** – qüssələnmək, kədərlənmək. *Tutqun havadan adamın ürəyi qısılır.* **Ürəyi qızınmaq** – xoşlamaq, xoşuna gəlmək, bəyənmək. [Xəlil:] *Səni görən kimi ürəyim qızındı, xoşuma gəldin.* S.Rəhman. **Ürəyi qızmaq** – 1) inanmaq, etibar etmək; qızmaq. *Hərçənd* [Gülpərinin] *bu şəhərdə tanışları vardı, amma onlara da ürəyi qızmırdı*. S.S.Axundov. [Gövhər xanım:] *Onlara da ki ürəyim qızmır, ümid eləmirəm*. İ.Hüseynov; 2) b a x **ürəyi qızınmaq**. **Ürəyi qopmaq (qırılmaq)** – bərk qorxmaq, qorxu hissi keçirmək. [Dərviş:] *Paltar xışıltısını eşidərək ürəyim qopdu*. A.Divanbəyoğlu. *Nərgizin ürəyi qopdu*. Ə.Məmmədxanlı. **Ürəyi qubarlanmaq (qubar bağlamaq)** – b a x **ürəyi qan olmaq (qana dönmək)**. *Kərəmin ürəyi qubarlandı, sazını dərdli sinəsinə basıb dedi*. "Əsli və Kərəm". **Ürəyi quş kimi çırpınmaq** – b a x **ürəyi yarpaq kimi əsmək**. *Yol qısaldıqca Nəcəfin ürəyi quş kimi çırpınır, səbri tükənirdi*. Q.İlkin. **Ürəyi nanə (nanə yarpağı) kimi əsmək (titrəmək)** – b a x **ürəyi əsmək**. **Ürəyi od tutmaq (od tutub yanmaq)** – b a x **ürəyi yaralanmaq**. *Gəlirəm dəhşətə gördüklərimdən; Od tutur ürəyim, hərlənir başım*. S.Rüstəm. *Əbilin*

*tüstüsü təpəsindən çıxır, ürəyi od tutub yanırdı*. Ə.Vəliyev. **Ürəyi oxşamaq** – həzz vermək, ləzzət vermək, zövq vermək. *Bu musiqi adamın ürəyini oxşayır*. **Ürəyi olmaq** – arzu etmək, arzusunda olmaq, istəmək. **Ürəyi parçalanmaq (parça-parça olmaq)** – b a x **ürəyi partlamaq** 1-ci mənada. *Qoparıb atmışdılar bir gülü budağından; Ürəyim parçalandı, hücum çəkdi dərd mənə*. S.Rüstəm. [Əbdülkərim:] *Od çıxırdı elə bil o yanıqlı nəfəsdən; Qana dönmüş ürəyim parçalandı bu səsdən*. B.Vahabzadə. **Ürəyi partlamaq** – 1) intizardan, kədərdən, pis xəbərdən bərk həyəcanlanmaq, kədərlənmək, ürəyi parçalanmaq. [Məryəmin] *fikirdən, qüssədən az qaldı ürəyi partlasın*. M.İbrahimov; 2) ürəyin fəaliyyətinin dayanması nəticəsində ölmək. *Yarım saat keçməmişdi ki, Hacı Nəsirin dükanda ürəyi partlayıb vəfat etməsi xəbəri gəldi*. S.S.Axundov. **Ürəyi sakitləşmək (sakit olmaq)** – sakit olmaq, sakitləşmək, rahatlanmaq, nigarançılıqdan qurtarmaq, xatircəm olmaq. [Ata:] *Qızım, bu vilayətdə əgər ürəyin sakit olmursa, köçüb, başqa vilayətə gedək*. (Nağıl). *Əmisi uşaqları peşkəş qutularını açmamış Ağcanın ürəyi sakitləşməzdi*. Mir Cəlal. **Ürəyi səksəkədə (səksəkəli) olmaq** – təşviş, təlaş keçirmək, intizarda olmaq. *Oturmuşdum səkidə; Ürəyim səksəkədə; Yardan baş alma gəldi; Bir qızıl nəlbəkidə*. (Bayatı). **Ürəyi sərinləmək** – rahatlaşmaq, sakitləşmək, xatircəm olmaq. **Ürəyi sıxılmaq** – kədərdən, qəmdən, yorğunluqdan, yaxud acınacaqlı bir şeyi görməkdən üzülmək, üzüntü duymaq, ürəyi ağrımaq, qəlbi sıxılmaq. *Saçları dağınıq dolaşırsan tək; Sıxılır yalnızlıq əlində ürək*. Ə.Cavad. *Budaqları sınıq ağacları görərkən yolçunun ürəyi sıxıldı*. Ə.Məmmədxanlı. **Ürəyi sınmaq** – incimək, qəlbi sınmaq. [Pəri:] *Bəhram! Sən xoşəxlaqsan, amma arabir sənin bu hərəkətlərini görəndə ürəyim tamamilə səndən sınır*. C.Cabbarlı. *Tərif etsəm, məni gözəllər qınar; Etməsəm, bilirəm, ürəyin sınar*. M.Rahim. **Ürəyi sızıldamaq** – b a x **ürəyi ağrımaq**. **Ürəyi soğan qabığı kimi soyulmaq** – b a x **ürəyi yanmaq** 1-ci mənada. **Ürəyi soyumaq** – 1) sakitləşmək, rahat olmaq, xatircəm olmaq. [Canbalayev:] *Ürəyi soyumayıb, indi də ailəmin içinə əl atır, ürəyimi partlatmağa çalışır*. İ.Hüseynov; 2) incimək, ürəyi sınmaq, qəlbi sınmaq. [Ceyniz:] [Şiz] *əllərini ac qurd kimi quzu buduna uzadandan bəri ürəyim ondan soyumuşdu*. Çəmənzəminli. **Ürəyi sökülmək (tel-tel olmaq)** – son dərəcə kədərlənmək, qəmlənmək. *Sökülür ürəyim, tutulur dilim*. M.Rahim. [Nazlı Gülzara:] *Bir yandan sevinirəm, bir yandan ürəyim tel-tel olur*. Ə.Məmmədxanlı. **Ürəyi şama dönmək (şam kimi ərimək)** – b a x **ürəyi ərimək**. *Narınca bax, narınca; Saxlaram saralınca; Şama döndü ürəyim; Səndən cavab alınca*. (Bayatı). **Ürəyi şan-şan olmaq** – b a x **ürəyi parçalanmaq (parça-parça olmaq)**. *Pəri Soltan əhvalatı eşidəndə ürəyi şan-şan olub dedi*. (Nağıl). *Ürəyimiz oldu şan-şan; Aldığımız bu yaradan*. B.Vahabzadə. **Ürəyi şişmək** – 1) b a x **ürəyi dağa dönmək**. *Oğlunun müvəffəqiyyətindən atanın ürəyi şişdi*; 2) darıxmaq, təngə gəlmək. *Sabirin* "*arizi qəmlər əlindən*"; *Ciyəri dağlandı, ürəyi şişdi; O ürək dünyanı dərk edən gündən; Nə qədər cəfaya tab eyləmişdi*. B.Vahabzadə. **Ürəyi tir-tir əsmək** – bərk həyəcan, iztirab keçirmək. **Ürəyi titrəmək** – b a x **ürəyi əsmək**. *Bilsəydi ki, yerimdə mən durmuşam dağ kimi; Məgər titrəyərdimi ürəyi yarpaq kibi?* X.Rza. **Ürəyi tutmaq** – 1) xoşuna gəlmək, xoşlamaq, sevmək, bəyənmək, ürəyinə yatmaq. [Gəldiyev:] *Bəlkə sizin təsadüf saydığınız adam qızınızın xoşuna gəlmişdir, bəlkə ürəyi tutmuşdur*. Mir Cəlal; 2) ürək ağrısı tutmaq. **Ürəyi tutulmaq** – qəmlənmək, kədərlənmək. [Asya:] *Ay Gülçöhrə, sən oxuyanda həmişə mənim ürəyim tutulur, bikef oluram*. Ü.Hacıbəyov. **Ürəyi tükdən nazik** – ürəyiyumşaq, ürəyinazik, çox riqqətli adam haqqında. **Ürəyi uçmaq** – çox sevinmək, həddən artıq şadlanmaq. **Ürəyi uçunmaq** – bihal olmaq, titrəmək. *Oğlunun tutduğu işdən kişinin qəzəblənəcəyini yaxşı bildiyindən, Salatının ürəyi uçunurdu*. İ.Şıxlı. **Ürəyi üstündə durmamaq** – qorxudan, iztirabdan, intizardan və s.-dən bərk həyəcan keçirmək, çox narahat olmaq. [Gülnaz:] *Ax, qorxudan ürəyim üstümdə durmur*. Ü.Hacıbəyov. **Ürəyi üstünə gəlmək** – əvvəlki rahatlığı, təskinliyi, xatircəmliyi qayıtmaq, rahat olmağa başlamaq.

[Sona Həmzəyə:] *Denən heç nə yoxdur, xəbər yalandır,* [Qadirin] *bəlkə ürəyi üstünə gəlsin!* Ə.Əbülhəsən. **Ürəyi üzülmək** – b a x **ürəyi ərimək**. **Ürəyi vurulmaq** – sevmək, məhəbbət salmaq. *Ona vurulmuş ürəyim; Ondan ayrılmamış bir an; Nə arzum, nə diləyim.* N.Rəfibəyli. **Ürəyi yanmaq** – 1) yazığı gəlmək, rəhmi gəlmək, acımaq. *Paşa Qəribin ağlamağını görüb ürəyi yandı.* "Aşıq Qərib". [Nəbi:] *Mən də, doğrusu, atayam, ürəyim yanır, qızıma yazığım gəlir.* Ə.Haqverdiyev; 2) bərk susamaq, susuzlamaq. [Qarı:] *Qızım, bir qaşıq su ver, içim, ürəyim yaman yanır.* (Nağıl). [Yunis:] *Su ver, xalacan, ürəyim yanır...* Ə.Məmmədxanlı. **Ürəyi yaralanmaq** – pis bir şeydən, hadisədən və s.-dən mütəəssir olmaq, kədərlənmək. **Ürəyi yarpaq kimi əsmək** – b a x **ürəyi əsmək**. **Ürəyi yerində olmamaq** – narahat olmaq, həyəcan keçirmək, iztirab içində olmaq. **Ürəyi yerin-dən qopmaq (oynamaq)** – b a x **ürəyi qopmaq**. **Ürəyi yerindən oynamaq (qopmaq)** – b a x **ürəyi qopmaq**. *Bu an birdən aşağıdan elə bir qışqırıq qopdu ki, ürəyim yerindən oynadı.* Ə.Məmmədxanlı. **Ürəyi yerinə gəlmək** – bərk həyəcandan, qorxudan sonra sakitləşmək, rahat olmaq, asudə nəfəs almağa başlamaq. *Tamaşanın ürəyi yerinə gəldi.* Mir Cəlal. **Ürəyi yuxalmaq** – b a x **ürəyi kövrəlmək**. *Bunları düşünə-düşünə Çimnaz arvadın ürəyi yuxaldı, gözlərinə yaş gəldi.* Ə.Əbülhəsən. **Ürəyi yumşalmaq** – acığı soyumaq, qəzəbi keçmək, mülayimləşmək. *Qəmərin ürəyi yumşaldı, gözlərinin yaşını abi-niysan kimi töküb dedi: – Mehriban dayı, mən yuxu görmüşəmsə, bəs bu üzük nədir?* (Nağıl). *Sadıqla Kərimi görən kimi* [Xanpərinin] *ürəyi yumşaldı.* Ə.Vəliyev. **Ürəyində daş bağlamaq** – b a x **ürəyində qalmaq**. **Ürəyində gizlətmək** – b a x **ürəyində saxlamaq** 1-ci mənada. *Arzusunu ürəyində gizlətmək.* **Ürəyində kök salmaq** – unudulmamaq, həmişə yadda, xatirdə olmaq, unudulmaz olmaq, həmişəlik yadda qalmaq. *İki xalqın ürəyində kök salıb; Füzulinin, Nəvainin qəzəli.* S.Rüstəm. **Ürəyində qalmaq** – 1) həyata keçməmək, yerinə yetməmək. [Ədalət Ehtişamiyə:] *Bu mənfur niyyətiniz ürəyinizdə qalacaq, Sərhəng!..* Ə.Məmmədxanlı; 2) deyilməmiş qalmaq, ifadə edilməmiş halda qalmaq. *Qaçayın sözləri bir nisgil kimi ürəyində qaldı.* Ə.Vəliyev; 3) boğazında qalmaq (tikə və s.). **Ürəyində yağ qalmamaq** – b a x **ürəyinin yağı ərimək**. *Cəfərin ata və anasını gözləməkdən ürəyində yağ qalmamışdı.* Ə.Vəliyev. **Ürəyində yer eləmək** – unuda bilməmək, xatirindən çıxara bilməmək, həmişə yadında olmaq. *Bu arzu onun ürəyində yer elədi.* **Ürəyindən çıxarmaq** – qəlbindən çıxarmaq, unutmaq, birdəfəlik əl çəkmək. *Məhəbbətini ürəyindən çıxarmaq. Kini ürəyindən çıxarmaq.* – [Surxay Aydına:] *Sən bu gün hər şeyi səmimi bir andla ürəyindən çıxar.* C.Cabbarlı. **Ürəyindən xəbər vermək** – 1) birinin ürəyində olan fikri qabaqcadan hiss edirmişcəsinə söyləmək, ifadə etmək. [Ana:] *Can bala, – dedi, – ürəyimdən xəbər verdin!* M.Rzaquluzadə; 2) ruhunu oxşamaq, xoşlandırmaq. *Bu, hekayənin sarı simidir, bu sim lap yerində çalınır və oxucunun ürəyindən xəbər verir.* M.İbrahimov. **Ürəyindən keçmək** – ürəyində arzu etmək, istəmək. [Qaçayın] *ürəyindən keçdi ki, Ataşla can-dildən söhbət eləsin.* Ə.Vəliyev. **Ürəyindən qara qanlar axmaq (getmək)** – acı, xoşagəlməz, yaxud qorxulu bir hadisəni, işi təsəvvürə gətirmək, dərin həyəcan və iztirab keçirmək. *Poladzadə sakit qulaq asa bilmir, ürəyindən qara qanlar axırdı.* Ə.Vəliyev. [Nəcəf bəy Bəhruza:] [Məclis] *üzdən sənə elə* [təntənəli] *görsənir, bacıoğlu, amma içəridə ürəyimizdən qara qanlar gedir.* Ə.Məmmədxanlı. **Ürəyindən qoparıb (silib, çıxarıb) atmaq** – b a x **ürəyindən çıxarmaq**. *Oğlan bura gəlməyinə peşman olmuşdu və qəlbində qəflətən baş qaldırmış bu hissi boğmağa çalışırdı. Boğdu bu hissi. Ürəyindən çıxarıb, bayaq gözlərinə görünən ağ pərdənin arxasına atdı...* İ.Məlikzadə. **Ürəyindən olmaq** – istədiyi, arzu etdiyi kimi olmaq. *Aygünün də ürəyindən oldu bu xəbər...* S.Vurğun. **Ürəyindən silmək, silib (çıxarıb) atmaq** – b a x **ürəyindən çıxarmaq**. [Nəcəf:] *Eybi yoxdur, – dedi, – mən sənin etdiklərinin hamısını ürəyimdən silib ataram.* Q.İlkin. **Ürəyindən tikan çıxarmaq** – tam razı salmaq, məmnun etmək. *Deyilənlər ürəyimdən tikan çıxartdı;* // birisindən başqasının qisasını

almaq, birisinin arzusunu yerinə yetirməklə onu tam razı salmaq, məmnun etmək. [Nisə xanım Şeydaya:] *Vahidova hücum eləmisən, ürəyimdən tikan çıxartmısan.* Ə.Məmmədxanlı. **Ürəyinə dağ basmaq (vurmaq, qoymaq, çəkmək)** – ürək ağrısı vermək, əzab və iztirab vermək, cəfa vermək, incitmək. [Camal:] *Eh, ay Nəbi dayı, bəylər çoxlarını qabıqdan çıxarıblar. Mənim ürəyimə də dağ çəkiblər.* Ə.Abasov. **Ürəyinə dağ-dağa düşmək** – təşvişə, qorxuya düşmək, şübhəyə düşmək. **Ürəyinə dağ-dağa(lar) gətirmək (salmaq)** – cürbəcür şübhələrlə özünü narahat etmək, təşvişə salmaq. [Nurulla:] *Uf, arvad, sağ olasan səni, niyə ürəyinə dağdağalar gətirirsən?* E.Sultanov. **Ürəyinə dammaq** – qabaqcadan hiss etmək, duymaq, sezmək. [Sona Mahmuda:] *Elə bil ürəyimə dammışdı ki, gələcəksən.* Z.Xəlil. **Ürəyinə dərd eləmək** – b a x **ürəyinə salmaq**. **Ürəyinə dəymək** – 1) b a x **ürəyini vurmaq**. *Mən sənə dedim ki, "bir az az ye, çünki turşdu, ürəyinə dəyər".* M.Ə.Sabir; 2) incitmək, qəlbini qırmaq, könlünü qırmaq, toxunmaq. [İbrahim:] *Onun ürəyinə dəymək heç bir layiq iş deyildi.* Ə.Haqverdiyev. *Maarif müdirinin istehzalı rəftarı Rüstəm kişinin ürəyinə dəydi.* M.İbrahimov. **Ürəyinə düşmək** – b a x **ürəyinə dammaq**. **Ürəyinə gəlmək** – güman etmək, zənn etmək, fikrinə gəlmək. [Surxay Aydına:] *O zavallı* [Gültəkin] *sənin rahatlığın üçün hər bir şeyi, hətta canını belə əsirgəmirkən sənin gör nə kimi şeylər ürəyinə gəlir.* C.Cabbarlı. **Ürəyinə gətirmək** – fikrinə gətirmək, ehtimal etmək, güman etmək. *Belə şeyləri ürəyinə gətirmə.* **Ürəyinə girmək** – müxtəlif yollarla öz tərəfinə çəkməyə, ələ almağa çalışmaq. **Ürəyinə işləmək** – təsir etmək, mütəəssir olmaq. **Ürəyinə qara-qura gəlmək** – ürəyinə şübhəli şeylər gəlmək, ürəyinə qara fikirlər gəlmək. [Nisə xanım Sədəfə:] *Amma ürəyinə qara-qura gəlməsin.* Ə.Məmmədxanlı. **Ürəyinə qaynar su səpmək** – b a x **ürəyinə dağ basmaq**. **Ürəyinə ləkə (xal) düşmək** – bir şeydən şübhələnməyə başlamaq. [Şirəlinin] *ürəyinə balaca xal düşdüsə də, üzə vurmayıb dedi.* S.Rəhman. **Ürəyinə ləkə (xal) salmaq** – şübhələndirmək, ürəyinə şübhə salmaq. **Ürəyinə od düşmək** – b a x **ürəyi od tutmaq (od tutub yanmaq)**. **Ürəyinə od salmaq** – bərk həyəcanlandırmaq, sarsıtmaq. **Ürəyinə ox batsın! (batmış!)** – b a x **ürəyinə güllə dəysin! (dəymiş!)**. **Ürəyinə salmaq** – bir şeyə çox həssaslıqla yanaşmaq, bir şeyə qarşı hədsiz həssaslıq göstərmək, bir şeyi özünə dərd eləmək. [Pəri:] *Bəhram! Sən ürəyinlə çox danışırsan. Ürəyinə heç bir şey salma!* C.Cabbarlı. *Almanı alma, gəlin! Al yerə salma, gəlin; Evdə söz-sov çox olar; Ürəyinə salma, gəlin!* (Bayatı). **Ürəyinə su (soyuq su) səpmək** – sakitləşdirmək, xatircəm etmək, rahatlandırmaq. *Camal danışdıqca elə bil Qərənfilin yanıqlı ürəyinə soyuq su səpirdilər.* Ə.Vəliyev. **Ürəyinə toxunmaq** – b a x **ürəyinə dəymək**. [Aydəmir:] *Aydəmiri torpaqlara gömməmiş heç kəs onun ürəyinə toxunmaz. Unutma!* C.Cabbarlı. "*Azərbaycan!*" – *deyiləndə ayağa dur ki; Füzulinin ürəyinə toxuna bilər.* M.Araz. **Ürəyinə yağ kimi yayılmaq** – çox xoşuna gəlmək, çox ləzzət vermək, çox xoş gəlmək. *Bu sözlər ürəyimə yağ kimi yayıldı.* **Ürəyinə yatmaq (yapışmaq)** – xoşuna gəlmək, xoşlamaq, bəyənmək. [Əsgər:] *Gördüyüm qızlardan da xoşum gələni, ürəyimə yatanı bir nəfər olubdur.* Ü.Hacıbəyov. *Yaxından baxıb bələd olduqca Fərhadoğlunun ürəyi Əmiraslan babaya daha artıq yapışır.* S.Rəhimov. [Nazlı Nataşaya:] *Bizdə belədir. Elə ki oğlan ürəyinə yatdı, əvvəlcə ona göz-qaş elə.* Ə.Məmmədxanlı. **Ürəyinə yol tapmaq** – birinin məhəbbətini, hüsn-rəğbətini qazanmaq. **Ürəyinə güllə dəysin! (dəymiş!)** – qarğış ifadəsi. **Ürəyini açıb ortaya tökmək** – b a x **ürəyini açmaq** 1-ci mənada. *Telli bütün ürəyini açıb ortaya tökmüşdü.* S.Hüseyn. **Ürəyini açmaq** – 1) ürəyindəkiləri açıb demək, ürək sirrini demək, danışmaq; 2) sevindirmək, şadlandırmaq, qəmini, qüssəsini unutdurmaq. *Usta Murtuz xəstənin ürəyini açmaq üçün şirin söhbətlər elədi, məzhəkə dedi.* Mir Cəlal. *Lakin bunların heç birisi qızın ürəyini açmırdı.* Q.İlkin. **Ürəyini ağrıtmaq** – b a x **ürəyini incitmək**. *Bu duyğu Nərimanın ürəyini ağrıtdı.* Mir Cəlal. **Ürəyini almaq** – incimiş bir adama xoş sözlər söyləyərək onu sakitləşdirmək, incikliyini unutdurmağa çalışmaq.

*Qurban ustanın ürəyini almaq, onu sakitləşdirmək üçün ciddi dedi.* M.Süleymanov. **Ürəyini boşaltmaq** – ürəyində nə varsa hamısını söyləyib sakitləşmək, rahatlanmaq. *Mirzə Cavad o ki demək idi, oğluna deyib ürəyini boşaltdı.* Ə.Haqverdiyev. [Yusif:] *Dedim, qoy ürəyini boşaltsın, axıra qədər dinməzcə qulaq asdım.* B.Bayramov. **Ürəyini buz kimi saxlamaq** – tamamilə sakit olmaq, xatircəm olmaq, soyuqqanlılıq göstərmək. **Ürəyini çalmaq** – b a x **ürəyini ovlamaq**. **Ürəyini çəkmək (çürütmək)** – üzüntü vermək, əldən salmaq, canını üzmək, usandırmaq, üzmək. **Ürəyini dəlmək (deşmək, didmək)** – ruhi əzab vermək, incitmək, əziyyət vermək. [Banı:] *Banının ürəyin deşdin; Boynuna xələtin biçdin.* “Aşıq Qərib”. [Solmaz Altunbaya:] *Fəqət neçin ürəyimi didirsən!* C.Cabbarlı. **Ürəyini dindirmək** – oxşamaq, əzizləmək, nəvaziş göstərmək. **Ürəyini düşürmək** – b a x **ürəyini qoparmaq**. **Ürəyini ələ almaq** – rəğbətini, hüsn-təvəccöhünü, sevgisini qazanmaq. [Müəllim] *bir gənclərin ürəyini deyil, hətta qocaların da ürəyini ələ almağı bacarırdı.* S.Hüseyn. **Ürəyini əritmək** – b a x **ürəyinin yağını əritmək**. **Ürəyini gen saxlamaq** – narahat olmamaq, xatircəm olmaq. **Ürəyini gəmirmək** – b a x **ürəyini yemək**. [Rəşid:] *Yenə də dumanlı bir şübhə ürəyimi gəmirirdi.* İ.Hüseynov. **Ürəyini gizlətmək** – öz fikrini, niyyətini gizli saxlamaq, ürəyindəkiləri deməmək. **Ürəyini incitmək** – mənəvi əzab və iztirab vermək. **Ürəyini isitmək** – sevindirmək, şadlandırmaq, fərəhləndirmək. *Günəş və gülüş hamının ürəyini isidirdi.* S.Rəhman. **Ürəyini qan etmək (qana döndərmək)** – iztirab vermək, ruhi əzab vermək, incitmək. *Genə kimlər ürəyini qan edəcəksən, ey məh!* S.Ə.Şirvani. *Bu mehriban, bu qayğılı sözlər Dilavərin ürəyini qana döndərdi.* V.Şıxlı. **Ürəyini qısmaq** – b a x **ürəyini sıxmaq**. *Leyla uşaqların ürəyini qısmamaq üçün Qəşəmlə olan münasibətlərini qızlarına bildirməmişdi.* S.Rəhimov. **Ürəyini qopar(t)maq** – bərk qorxutmaq, dəhşətləndirmək. **Ürəyini qoparıb vermək** – b a x **ürəyini yedirtmək**. **Ürəyini qoymaq** – b a x **ürəyini vermək**. **Ürəyini qubarlatmaq (qubar etmək)** – ruhi əzab, iztirab vermək, bıqdırmaq, cana gətirmək. **Ürəyini qurd yemək** – daxili həyəcan və iztirab keçirmək, bir şeyin aqibətindən dolayı çox narahat olmaq. **Ürəyini oxşamaq** – xoşuna gəlmək, ləzzət vermək, zövq vermək, xoşlamaq. **Ürəyini oxumaq** – ürəyindəkiləri başa düşmək, hiss etmək. **Ürəyini ovlamaq** – özünü sevdirmək, özünə məftun etmək. **Ürəyini ovuşdurmaq** – b a x **ürəyini yemək**. **Ürəyini partlatmaq (parçalamaq, parça-parça eləmək)** – ağır ruhi əzab vermək, incitmək. **Ürəyini salmaq** – b a x **ürəyini qoparmaq**. **Ürəyini sərinləşdirmək** – rahat etmək, sakitləşdirmək, xatircəm etmək. **Ürəyini sıxmaq** – sıxılmaq, darıxmaq, dərd çəkmək, fikir eləmək. [Məşədi Oruc:] *Ay yazıq bala, ürəyini sıxma, sən dəxi yetim deyilsən.* C.Məmmədquluzadə. [Qarı nənə:] *Sağdır, qızım, sağdır. Sən heç ürəyini sıxma!* M.Dilbazi. **Ürəyini sındırmaq** – b a x **ürəyinə dəymək** 2-ci mənada. [Pəri xanım:] *Mən gərək ürəyimi sındıram, mənə zülm edən namərddən qisas alam.* Ə.Haqverdiyev. [Bəhram:] *Pəri! Sara bizə mane ola bilməyəcək. Yetimdir, onun ürəyini sındırmamalıyıq.* C.Cabbarlı. **Ürəyini siyirmək** – doydurmayan, aclığı rəf etməyən yemək haqqında. **Ürəyini soyutmaq** – b a x **ürəyinə su səpmək**. [Mustafa] *..bununla ürəyini soyutmaq istəyirdi.* S.Vəliyev. **Ürəyini şan-şan etmək** – b a x **ürəyini parçalamaq**. [Dərviş:] *Ciyər yaralarımı təzələməkdən, ürəyimi şan-şan etməkdən sənə fayda varmı?* A.Divanbəyoğlu. **Ürəyini üzmək** – 1) b a x **ürəyini çəkmək**; 2) üzmək, əldən salmaq, taqətdən salmaq, yormaq. *Ustanın azarı gün-gündən şiddətlənirdi, bədəni zəifləşib gücdən düşürdü. Soyuq və aclıq ürəyini üzürdü, sifətində həyat nişanəsi yox idi.* Çəmənzəminli. **Ürəyini vermək** – bütün varlığı ilə bağlanmaq, candan sevmək. *O, bircə arzuya, bircə niyyətə; Verdi ürəyini, verdi büsbütün.* B.Vahabzadə. **Ürəyini vurmaq** – təngə gətirmək, bezdirmək, bıqdırmaq, usandırmaq. **Ürəyini yandırmaq** – dərin təsir etmək, həyəcan və iztirab çəkdirmək. [Qoşatxan:] *Laqeydlik kənd müəllimi üçün dözülməz bir bəladır, deməli, heç şey onun ürəyini yandırmır.* M.İbrahimov. **Ürəyini yaralamaq** – b a x **ürəyini qubar-**

**latmaq**. **Ürəyini yarmaq** – b a x **ürəyini qoparmaq**. **Ürəyini yedirtmək** – həddən artıq əzizləmək, nəvaziş göstərmək, qeydinə qalmaq. *Ürəyini uşaqlarına yedirtmək.* **Ürəyini yerindən oynatmaq** – b a x **ürəyini qopar(t)maq**. **Ürəyini yeyə-yeyə qalmaq** – intizar və təşviş içində olmaq, ağır iztirab içində gözləmək, nigarançılıq çəkmək. **Ürəyini zorlamaq** – ürəyi istəmədiyi halda bir işi görməyə, qəbul etməyə, bir şeylə razı olmağa özünü məcbur etmək. [Aydın:] *İki aydan bəri nə qədər ürəyimi zorlayıramsa olmur*. C.Cabbarlı. **Ürəyinin başı (ucu) ağrımaq (yanmaq, sızıldamaq, sökülmək)** – b a x **ürəyi ağrımaq**. *İlk dəfə idi ki, Sadıq kişi oğlunun – əziz-xələf oğlunun səsindəki həzin riqqəti görüb duyur, ürəyinin başı ağrıyırdı.* Mir Cəlal. *Bülənd ürəyinin başı sökülmüş kimi dərin bir qəlb ağrısı ilə* [Sonadan] *aralandısa da, düz qabağında durub iri əli ilə onun başını oxşadı.* Ə.Əbülhəsən. **Ürəyinin içini yemək** – b a x **ürəyini yemək**. [Xanımnaz Almaza:] *Ay balam, səhərdən hardasan? Ürəyimin içini yemişəm*. C.Cabbarlı. **Ürəyinin qanı ilə** – dərin kədər hissi ilə, böyük hüznlə, ürəyi yana-yana. **Ürəyinin qurdunu öldürmək** – azacıq yemək, bir balaca yemək. **Ürəyinin quşu uçmaq** – b a x **ürəyi uçmaq**. **Ürəyinin telləri əsmək** – b a x **ürəyi əsmək** 2-ci mənada. [Məzlum:] *Birdən stolun üstündəki skripkanı gördükdə ürəyimin telləri əsdi, nə edəcəyimi bilmədim*. S.Vəliyev. **Ürəyinin ucu göynəmək** – b a x **ürəyinin başı ağrımaq**. **Ürəyinin yağı (piyi) ərimək** – b a x **ürəyi ərimək**. [Qərib:] *Səni gördüm, ağlım oldu pərişan; Əridi ürəyimin yağı, Ağcaqız!* "Aşıq Qərib". **Ürəyinin yağını (piyini) əritmək** – xoşagəlməz bir şeyin aqibətini gözlədə-gözlədə iztirab vermək, incitmək, mənəvi əzab vermək. [Bərbərzadə:] *Maral, gəl məni incitmə. Onsuz da ürəyimin yağını əritmisən.* S.Rəhman. **Ürəyinin yağını (piyini) yedirtmək** – b a x **ürəyini yedirtmək**. **Ürəyinin yağını (piyini) yemək** – b a x **ürəyini yemək**. **Ürəyinin yanğısını söndürmək** – susuzluğunu rəf etmək, su içmək. [Əliqulu:] *Ürəyimizin yanğısını söndürmək ümidindən əl çəkib avtobusun yola düşməsini gözləməli olduq.* S.Rəhman.

**ÜRƏKAÇAN, ÜRƏKAÇICI** *sif.* Adamı fərəhləndirən, ürəyini açan, sevindirici. *Ürəkaçan xəbər. – Ağasəfər Həmzənin bu cavan qardaşı oğlundan bir şey soruşmaq istədi ki, bəlkə ondan ürəkaçıcı bir cavab eşitsin.* Ə.Əbülhəsən. *Bayır yumşaq, ürəkaçan bir bayazlığa bürünmüşdü*. B.Bayramov.

**ÜRƏKAĞRISI** *is.* Dərin təəssüf. [Vəkil:] *Bu nə daşürəkli adamdır?! – deyə, ürəkağrısı ilə fikirləşirdi*. Y.Əzimzadə.

**ÜRƏKALTI** *sif. anat.* Ürəyin altında yerləşən, olan. *Ürəkaltı nahiyə.*

**ÜRƏKBİR** *sif.* Çox yaxın, səmimi. *Ürəkbir dost*. – [Gənc:] *İndi isə sürət qatarında qızıl diplomla, əlbir və ürəkbir yoldaşlarımla evə dönürəm.* Mir Cəlal.

**ÜRƏKBULANDIRAN, ÜRƏKBULANDIRICI** *sif.* 1. Ürəyi bulandıran. *Ürəkbulandırıcı qoxu*. – [Xiyabani-Xanabadda evlərdə] *yay-qış ürəkbulandırıcı bir çirk, dözülməz bir üfunət hökm sürməkdədir*. M.İbrahimov.

2. *məc.* Nifrət, ikrah hissi oyadan, mənfur, xoşagəlməz. *Ancaq* [Fərrux və Qurban] *tez-tez xoşagəlməyən, ürəkbulandırıcı xəbər eşidirdilər.* Ə.Vəliyev.

**ÜRƏKBULANMA(SI)** *is.* Mədənin qarışması, qusma ehtiyacı nəticəsində ürəyin bulanması; öyümə. *Xəstəliyin başlanğıcında bəzən ürəkbulanma* (*öyümə*) *və qusma halları ola bilər.*

**ÜRƏKCİK** "Ürək"dən *oxş.* və *kiç*. *Dilbərin ürəkciyi yerindən oynadı, dərin bir ah qopardı*. C.Cabbarlı.

**ÜRƏKÇIRPINTISI** *is.* 1. Bərk ürək döyünməsi.

2. *məc.* Həyəcan, iztirab. ☐ **Ürəkçırpıntısı ilə** – ürəyi çırpına-çırpına (sevincdən, maraqdan və s. hisslərdən).

**ÜRƏKDƏN** *zərf* Can və könüldən, səmimi olaraq; qəlbən. *Muxtar çox düşünmüş, götür-qoy eləmiş, nəhayət, Çiçəyi ürəkdən sevmişdi.* Ə.Vəliyev.

**ÜRƏK-DİRƏK: ürək-dirək vermək** – ürək vermək, ürəkləndirmək, ruhlandırmaq, ümidləndirmək, təsəlli vermək, cəsarətləndirmək. *Məşədibəy Səlimə ürək-dirək vermək əvəzinə, onu daha da kədərləndirdi*. M.Hüseyn. *Qayınanasının ona ürək-dirək verməsinə baxmayaraq, Durna qərarsız oldu.*

İ.Əfəndiyev. **Ürək-dirək olmaq** – arxa olmaq, kömək olmaq, arxasında durmaq.

**ÜRƏKDOLUSU** *zərf* Həvəslə, fəxrlə, ağızdolusu, sevinə-sevinə.

**ÜRƏKDÖYÜNMƏ(Sİ)** *is.* Xəstəlik, həyəcan, iti yerimək və s. nəticəsində ürəyin tez-tez döyünməsi. [Xırdaxanım:] *İstəmirəm, elə ürək döyünməm artıb*. N.Vəzirov.

**ÜRƏK-GÖBƏK: ürək-göbək qalmamaq** *zar.* – gülməkdən qəşş etmək. *Xan bayıra çıxıb gördü ki, Qəhrəman gəlir, amma altında bir at var ki, altı ayağı, alnında bir gözü, iki də maral buynuzuna oxşar buynuzu vardı. Xanda ürək-göbək qalmadı*. (Nağıl). **Ürək-göbəyi düşmək** – bax **ürəyi düşmək**. [Qarı:] *Çaydan keçəndə qurbağadan qorxub, ürək-göbəyi düşüb, dəli olub*. "Qurbani". **Ürək-göbəyini yemək** – bərk qorxmaq, bərk həyəcanlanmaq.

**ÜRƏKKEÇMƏ, ÜRƏKGETMƏ** *is.* Xəstəlik, ruhi sarsıntı nəticəsində huşunu itirmə halı; bayğınlıq, bihuşluq. [Mehriban] *indi bir ay olardı ki, ürəkkeçmənin əlaməti olan halları özündə hiss etməyirdi*. S.Hüseyn.

**ÜRƏKQOPMA** bax **ürəkkeçmə**. *Gecə yarısı Feyzullanın arvadını, uşaqlarını ürəkqopma azarına salıb, evin altını üstünə çevirdilər*. Ə.Haqverdiyev.

**ÜRƏKLƏNDİRİCİ** *sif.* Ürəkləndirən, cəsarət verən, cəsarətini artıran, ürək-dirək verən, ruhlandıran (bir işə). *Ürəkləndirici sözlər.*

**ÜRƏKLƏNDİRMƏ** "Ürəkləndirmək"dən *f.is.*

**ÜRƏKLƏNDİRMƏK** *f.* Cəsarətləndirmək, cəsarət vermək, ruhlandırmaq, ürək-dirək vermək. *Qoçər arabir Beyrəyin obasına gəlir, onun ata-anası, bacıları ilə görüşür, onları da ürəkləndirirdi.* M.Rzaquluzadə. [Bəhlul:] *Şövkət bacının da bizə köməkçi olduğu məni ürəkləndirdi.* B.Bayramov.

**ÜRƏKLƏNMƏ** "Ürəklənmək"dən *f.is.*

**ÜRƏKLƏNMƏK** *f.* Cəsarətlənmək, cəsarəti artmaq, cəsarət etmək, cəsarəti özünə qayıtmaq. *Dilənçinin açıq üzündən və mehriban danışığından Nurəddin ürəklənib ağacdan düşdü.* S.S.Axundov. *Aydın bu sözlərdən bir az di ürəklənib sevinə-sevinə dedi...* M.Rzaquluzadə.

**ÜRƏKLİ** *sif.* Heç şeydən qorxmayan, qoçaq, cəsur, igid, qorxubilməz. [Yusif:] *Məhəbbət həqiqət yaxşı şeydir, danışmayanı danışdıran, çirkini gözəl edən, qorxağı ürəkli edən məhəbbətdir*. N.Nərimanov. *Fatmanisə xala çox ürəkli idi.* Ə.Haqverdiyev.

**ÜRƏKLİLİK** *is.* Ürəkli adamın hal və keyfiyyəti; qorxubilməzlik, cəsarət.

**ÜRƏKSIXAN, ÜRƏKSIXICI** *sif.* 1. Adamın ürəyini sıxan, cansıxan, cansıxıcı; qəm, kədər gətirən. *Ürəksıxan xarabalıq. Ürəksıxıcı qış axşamı.*

2. Ürəyi sıxan, ürəyə pis təsir edən, nəfəs almağı çətinləşdirən, boğucu. *Otağın ürəksıxan havası. – Çox isti və ürəksıxıcı bürkü idi.* Ə.Abasov. *Şahmar dinmədi. Aralığa ürəksıxan sükut çökdü*. B.Bayramov.

**ÜRƏKSIXINTISI** *is.* Ürəyi sıxan hal, keyfiyyət, şey.

**ÜRƏKSINDIRAN, ÜRƏKSINDIRICI** *sif.* Adamın qəlbini qıran, toxunan; toxunaqlı. *Ürəksındırıcı söz.*

**ÜRƏKSİZ** *sif.* və *zərf* 1. Qorxaq, ağciyər, xoflu, cəsarətsiz. [Tarverdi:] *Mən də qorxumdan ki mənə ürəksiz deməsinlər, quldurluğa getdim.* M.F.Axundzadə.

2. Həvəssiz, istəmədən, həvəsi olmadığı halda, həvəssiz, maraqsız. *Allahqulu bazara da elə ürəksiz çıxmışdı*. Ə.Əbülhəsən. *Mərcan nənə qayıtsa da, ürəksiz qayıdırdı*. Mir Cəlal.

**ÜRƏKSİZCƏSİNƏ** *zərf* 1. Qorxaqcasına, cəsarətsizcəsinə. *Ürəksizcəsinə hərəkət etmək.*

2. Həvəssiz(cəsinə).

**ÜRƏKSİZLİK** *is.* Cəsarətsizlik, qorxaqlıq.

**ÜRƏKVARİ** *sif.* Ürək şəklində olan; ürəyəoxşar.

**ÜRƏKVERƏN, ÜRƏKVERİCİ** *sif.* Ruhlandırıcı, təsəlliverici. *Ürəkverici xəbər.*

**ÜRƏKYAXAN, ÜRƏKYAXICI, ÜRƏKYANDIRAN, ÜRƏKYANDIRICI** *sif.* Ürəyə pis təsir edən, adamı sarsıdan; sarsıdıcı, təsirli, acınacaqlı. *Ürəkyandıran qışqırıq. Ürəkyaxıcı görünüş*. – [Eşikağası] *qapını açıb içəri baxanda ürəkyandırıcı bir mənzərəyə rast gəldi.* Çəmənzəminli. *Qaraca qızın ürəkyandırıcı faciəsindən rəhmdil Piri kişi xeyli qəmgin oldu.* S.S.Axundov.

**ÜRƏYƏOXŞAR** bax **ürəkvari**.

**ÜRƏYƏYATAN** *sif.* Xoşagələn, gözəşirin, gözəgəlimli, bəyənilən, cazibəli. [Məhbub xanım] *baxdı ki,* [Bəlli Əhməd], *düzdü, bir az kor-kobuddu, amma elə ürəyəyatan oğlandı ki, min paşa oğluna dəyər, min də xan oğluna*. "Koroğlu". // Qəşəng, yaxşı, xoşagələn, xoş. *Otaq sərin və ürəyəyatan idi.* İ.Əfəndiyev.

**ÜRƏYİAÇIQ** *sif.* Ürəyini gizlədə bilməyən, ürəyində nə varsa açıb söyləyən; açıqürəkli, təmizürəkli, səmimi. [Sara:] *Bəhram! Sən bilirsən ki, mən bir ürəyiaçıq, sadəlövh adamam*. C.Cabbarlı. [Zakir Mehribana:] *Görürsünüzmü, adam ürəyiaçıq olanda, hər şeyi düzünə deyəndə uduzur.* H.Seyidbəyli.

**ÜRƏYİAÇIQLIQ** *sif.* Ürəyiaçıq adamın xasiyyəti; açıqürəklilik, səmimilik.

**ÜRƏYİBƏRK** *sif.* Başqasının halına acımayan; sərtürəkli, daşürəkli, zalım, qəddar. *Ürəyibərk adam*.

**ÜRƏYİBƏRKLİK** *is.* Ürəyibərk adamın xasiyyəti; zalımlıq, qəddarlıq.

**ÜRƏYİDAĞLI** *sif.* Ürəyində dərdi, kədəri, nisgili olan; dərdli, kədərli, nisgilli.

**ÜRƏYİDAŞ** *sif.* Heç bir şeydən təsirlənməyən; daşürəkli, qəlbidaş; rəhmsiz, insafsız.

**ÜRƏYİGENİŞ** *sif.* Hamıya yaxşılıq edən, genişürəkli.

**ÜRƏYİİNCƏ** b a x **ürəyinazik**.

**ÜRƏYİİNCƏLİK** b a x **ürəyinaziklik**.

**ÜRƏYİQURDLU** *sif.* Başqasının xoşbəxtliyini istəməyən, hər şeyə, hər kəsə şübhə ilə baxan; xainürəkli, qəlbiqara, paxıl.

**ÜRƏYİQURDLULUQ** *is.* Ürəyiqurdlu adamın xasiyyəti; qəlbiqaralıq, paxıllıq.

**ÜRƏYİNCƏ** *zərf* İstədiyi, arzuladığı, ürəyində tutduğu kimi. *Burnaşov çariçanın mərhəmət və ədalətindən danışır, camaatın güzəranına, qoşunların halına toxunmur. Bu, Vaqifin ürəyincə deyildi*. Çəmənzəminli. ☐ **Ürəyincə olmaq** – istədiyi, arzuladığı kimi olmaq. *Fərmanın sözləri Baxış bəyin ürəyincə oldu.* Ə.Abasov. [Dustaq:] *Mən elə iş axtarırdım ki, ürəyimcə olsun*. H.Seyidbəyli.

**ÜRƏYİNAZİK** b a x **ürəyiyumşaq**.

**ÜRƏYİNAZİKLİK** b a x **ürəyiyumşaqlıq**.

**ÜRƏYİSINIQ** *sif.* İncimiş, küsmüş, küskün, qəlbiqırıq, ürəyi bir şeydən sınmış.

**ÜRƏYİSINIQLIQ** *is.* Ürəyisınıq adamın keyfiyyəti; küskünlük, qəlbiqırıqlıq.

**ÜRƏYİSÖZLÜ** *sif.* Ürəyində sözü olan, hələ deyilməmiş sözü olan.

**ÜRƏYİTƏMİZ** *sif.* Ürəyində paxıllıq, kin, küdurət olmayan, qəlbi təmiz olan; səmimi.

**ÜRƏYİYUXA** *sif.* Tez təsirlənən, mütəəssir olan, ürəyiyumşaq. [Tutu Qönçəyə:] *Mən səni bu qədər ürəyiyuxa* (z.) *bilməzdim*. Ə.Vəliyev.

**ÜRƏYİYUXALIQ** *is.* Ürəyiyuxa adamın xasiyyəti; ürəyiyumşaqlıq.

**ÜRƏYİYUMŞAQ** *sif.* Ürəyinazik, ürəyiyuxa, ürəyincə.

**ÜRƏYİYUMŞAQLIQ** *is.* Ürəyiyumşaq adamın xasiyyəti; ürəyinaziklik, ürəyiincəlik, ürəyiyuxalıq.

**ÜRF** *is.* [*ər.*] *kit.* Məcburi olmayıb zamanın tələbindən doğan adət, qayda, üsul, hökm, dəb. [Şeyx Sədra:] *Ürfü şər olmayır bu fikrə şərik; Çəkilir şeymidir bu sərsəmlik?* H.Cavid.

**ÜRF-ADƏT** *is.* [*ər.*] 1. Əxlaq, ədəb qaydaları; etika.

2. Adət və ənənə, adətlər. [Molla Qurban:] Elin qayda-qanunu, camaatın ürf-adəti var. Ə.Vəliyev.

**ÜRFAN** *is.* [*ər.*] *kit.* Bilik, biliş, kamal, maarif. *Əsrlər uzunu elm və ürfana axın buraxılmayan qadınlar təşnə adam kimi susuzluqlarını söndürməyə nail olmuşlardı.* T.Ş.Simurq. *Tutdu yer üzünü ürfan çırağı; Nura qərq elədi qonşu torpağı.* M.Rahim.

**ÜRKƏ** *is.* İkiyaşar at balası. [Qədir] *qaşlarını çataraq öz alapaça ürkəsindən danışmağa başlayırdı*. İ.Əfəndiyev. *Elə bu vaxt Zülfüqar kəhər ürkəni səyirdib böyürdən çıxdı.* B.Bayramov.

**ÜRKƏKLİK** *is.* Tez hürkmə və qorxma xasiyyəti; hürkəklik.

**ÜRKƏYƏN, ÜRKƏK** *sif.* Tez hürkən, hər şeydən hürkən, qorxan, əhli olmayan; vəhşi. *Qız isə ürkək ceyran balası kimi qaçırdı*. Mir Cəlal. *Bulud dağ döşündə dayanıb durmuş; Çöldə ürkək maral boynunu burmuş.* N.Rəfibəyli. // Ürkəklik, qorxu ifadə edən, bildirən; qorxaq. *Qadın öz ürkək nəzərləri ilə ətrafa baxıb fotoqrafın ardınca düşdü.* S.Vəliyev. [Hidayət] *sol yandan eşitdiyi hənirtiyə tərəf ürkək bir hərəkətlə çevrildi.* B.Bayramov.

**ÜRKMƏ** "Ürkmək"dən *f.is.*

**ÜRKMƏK** b a x **hürkmək**. [Zaman:] *Top səsindən atlar ürkdü, kişnəşdi.* C.Cabbarlı.

**ÜRKÜ** b a x **hürkü**. *Hünər uşaqlara məxsus bir ürkü və narahatlıqla gah əlindəki maşına, gah qonağa baxıb durur.* Mir Cəlal.

**ÜRKÜŞMƏ** "Ürküşmək"dən *f.is.*

**ÜRKÜŞMƏK** b a x **hürküşmək**. *Şahzadə İbrahim baxdı, əgər Kələ-kötür bu bədənnən bazara girə bilsə, camaat ürküşəcək.* (Nağıl). *Çəpişlər irəliyə gedir, bəzən ürküşür*. M.Seyidzadə.

**ÜRKÜTMƏ** "Ürkütmək"dən *f.is.*

**ÜRKÜTMƏK** b a x **hürkütmək**. [Gülöyşə] *doktoru ürkütmək, qaçarağa salmaq və lazım gəlsə, lap daşdan-qayadan belə uçurmaq istəyirdi.* S.Rəhimov. *Mahmudun hiss və həyəcan dolu baxışları, deyəsən, gənc qızı ürkütdü*. Ə.Əbülhəsən.

**ÜRPƏRMƏ** "Ürpərmək"dən *f.is.*

**ÜRPƏRMƏK: tükləri (tükü, əti, bədəni, əndamı) ürpərmək** – tükləri biz-biz qalxıb dərisi qabar-qabar olmaq (qorxudan, dəhşətdən və s. hisslərdən). *Sahillərə hücum çəkən dalğadır, ya dağ; Tük ürpərir, fikir çaşır onun səsindən*. S.Vurğun. *Çiçək dəhşətli mənzərəni gözü qabağına gətirdiyi üçün əndamı ürpərdi.* B.Bayramov.

**ÜRPƏŞMƏ** "Ürpəşmək"dən *f.is.*

**ÜRPƏŞMƏK** b a x **ürpərmək**. [Göyçəyin] *əti ürpəşdi. Başına ağrı sıçradı*. Ə.Vəliyev. *Bu baxışlardan qızın bədəni ürpəşdi və tez üzünü çevirdi.* Q.İlkin.

**ÜRPƏTMƏ** "Ürpətmək"dən *f.is.*

**ÜRPƏTMƏK**: **tükü (əti, bədəni) ürpətmək** – dəhşətə gətirmək, sarsıtmaq.

**ÜRYAN** *sif.* 1. Çılpaq, lüt. [Misir:] *Əkin əkən, biçin biçən, ov ovlayan; Bədənləri büsbütün üryan; Yoxsul babaların yurdudur.* O.Sarıvəlli.

2. Yarpağı tökülmüş, yarpaqsız, çılpaq (ağac, kol və s. haqqında). *Sərvü sənubərin afəti-xəzan; Soyub libasını qoymuşdu üryan.* Q.Zakir. *Buzlu çay sakit-sakit axır üryan ilğım kolları əsən şaxtalı küləyin altında o tərəf-bu tərəfə əyilirdi.* S.Rəhimov.

3. *məc*. Yoxsul, kasıb, lüt. *Mən, görürsən ki, nə cür üryanam*. A.Səhhət.

**ÜSKÜK** *is. məh*. b a x **oymaq**[3]. *Həsən sap çıxardıb sapladı və barmağına üskük taxıb, şalvarının arxasını diqqətlə büzmələməyə başladı.* Çəmənzəminli.

**ÜSKÜKOTU** *is. bot.* Dağ meşələrində, cəngəlliklərdə bitən, üskükə oxşar çiçəkləri olan çoxillik ot bitkisi.

**ÜSLUB** *is.* [*ər.*] 1. Yazıçının, rəssamın, heykəltəraşın, memarın, bəstəkarın və b.-nın yaradıcılığında özünü göstərən əsas ideya-bədii xüsusiyyətlərin, fərqlənmə əlamətlərinin vəhdəti; stil. *Romantik üslub. Qotik üslub. – Bir tərəfdə ərəb üslubunda yapılmış bir köşk, ötəki tərəfdə Şərq bazarı, qarşısında uzunsaçlı dərviş qəsidə oxuyur*. Çəmənzəminli. // Ümumiyyətlə, üsul, tərz.

2. Hər hansı bir yazıçı və ya bədii əsər, cərəyan, janr üçün səciyyəvi olan dil və nitq vasitələrindən istifadə üsullarının məcmusu; hər hansı bir yazıçının, əsərin dil və ifadə üsulu. *Qəzet üslubu. Felyeton üslubu. Nağıl üslubu.* // Nitqin sintaktik və sözlərin işlənmə formalarına uyğun olaraq qurulması. *Üslub səhvləri. Öz əsərinin üslubu üzərində işləmək. Məqalənin üslubunu düzəltmək.*

**ÜSLUBİ** *sif.* [*ər.*] Üsluba aid, üslubla əlaqədar, üslub baxımından. *Üslubi səhv. Lüğətdə üslubi işarələr. Romanın üslubi xüsusiyyətləri.*

**ÜSLUBİYYAT** *is.* [*ər.* "üslub" söz. cəmi] Ədəbiyyat nəzəriyyəsinin, bədii əsərin dil xüsusiyyətlərini və ifadə vasitələrini öyrənən bəhsi. // Bədii əsərin dilinin xüsusiyyətləri və ifadə vasitələri.

**ÜSRƏT** *is.* [*ər.*] *köhn.* 1. Çətinlik, zəhmət.

2. Sıxıntı, ehtiyac.

**ÜST** *sif.* və *zərf* 1. Bir şeyin ən yuxarı səthi, üzü; üzər (*alt* ziddi). *Şkafın üstünü təmizləmək. – Sona kağızı mizin üstünə qoymuşdu.* N.Nərimanov. *Dildarın hirsi xeyli soyumuş, köpü bir az alınmışdı. Könülsüz-könülsüz gedib, kuşetkanın üstündə oturdu*. Ə.Vəliyev.

2. Yuxarıda olan, yuxarıda yerləşən, yuxarıdakı. *Üst çənə. Üst dişlər. – Kərimqulu isə üst eyvanda dayandığı yerdən həyətə düşdü.* S.Rəhimov. *Mən hansı pilləkənlə yuxarı qalxacağımı bilmir, üst mərtəbənin pəncərələrini gözdən keçirirdim.* Ə.Məmmədxanlı.

3. Uzanmış halda olan adamın üst tərəfi. *Memar Sadıqzadə üstünə çəkdiyi ipək yorğanı sinəsinə qədər endirdi*. S.Rəhimov. [Növrəstə] *tərəkəmələrdən qalmış köhnə keçəni üstünə*

*çəkdiyi zaman qapıya bir təkan vuruldu*. Ə.Abasov.

4. Tikilinin, binanın yuxarıdakı səthi; dam. *Anbarın üstü örtülmüşdür. – Alagöz kənd-bəkənd dolanır, gecələrini uçuq daxmalarda, kənd kənarındakı üstü küləşli mərəklərdə keçirirdi*. S.Rəhimov. [Cavad] *evlərinin üstündən güclə görünən həmişə başıdumanlı Gədik dağını gördü*. Ə.Vəliyev.

5. Üzər. *Çayların üstündən buz körpü saldı; Seyrəldi get-gedə gediş-gəliş də*. S.Vurğun. *Kərimov cəld addımlarla çay kollarının üstündən keçib getdi*. H.Seyidbəyli.

6. Geyimin bayır tərəfi, üzü. *Üstünü ləkələmək. Üstünü silkələmək.*

7. Üstdən geyilən. *Mürşüd kişi köhnə qara şal pencəyinin ətəyini yuxarı qaldırıb, üst köynəyinin yamağını göstərdi.* Ə.Vəliyev. // Paltar, üst-baş. *Üstünü dəyişdirmək. Üstünü şotkalamaq. – Qız cəld üstünü çırpıb, qızara-qızara otağa qaçdı.* Çəmənzəminli.

8. Kənar, qıraq, yaxınlıq. *Nəriman yol üstündə dayanıb, gələn bir maşına dayanmaq işarəsi verdi.* Mir Cəlal. *Bu bağça mənim yolumun üstündə idi.* Mir Cəlal. // Bel, dal. *Koroğlu qırğı kimi şığıyıb Eyvazı götürdü, atın üstünə qoydu.* "Koroğlu". *Əbil kəhər atın üstündə çox vüqarla oturmuşdu.* Ə.Vəliyev.

9. **Üstündə** şəklində – səbəb bildirir; ...görə, ...səbəbinə. *Sənin üstündə mənə söz gələcək. Hər şeyin üstündə adam əsəbiləşməz. – Səfəri adam öldürmək üstündə Sibirə göndərdilər*. S.S.Axundov. *Cərimə verməmək üstündə, ya da başqa günah üstündə axtarılan yoxsul burada özünü asanlıqla aradan çıxara bilirdi.* Ə.Əbülhəsən.

10. Barəsində, haqqında, xüsusunda. [Nurcahan:] *Mən Səfiqulunun xalasıyam*. *Səninlə bir mətləb üstə danışmaq istəyirəm*. N.Vəzirov. ☐ **Nə üstə (üstdə)** – nə üçün, nəyə görə, nə səbəbə. [Cənnətəli ağa:] *Səni nə üstə vurdu, a gədə?* N.Vəzirov. *Kimsə dedi: – Bəy Almazı döyür. – Nə üstdə? – Çəkmə üstdə!* S.Rəhimov.

11. **Üstündəki** şəklində – ixtiyarındakı, öhdəsindəki, üzərindəki. [Mustafa xan] *Bainhəmə mən də və mənim üstümdəki qoşun da, hamımız özümüzü sənə qurban demişik*. Ə.Haqverdiyev.

◊ **Üst dodağı göy süpürür, alt dodağı yer** – çox qaşqabaqlı, acıqlı, üzügülməz adam haqqında. **Üstü açılmaq** – faş olmaq, məlum olmaq, ortaya çıxmaq. [Qaraca qız] *xeyli təşvişdə idi, çünki bilirdi ki, bu sirrin üstü açılsa, Pəricahan xanım onu buradan qovub, qızını da böyük tənbeh edəcəkdir*. S.S.Axundov. [Əsgər:] *Zərər yoxdur, bir-iki saatdan sonra mənim kələyimin üstü açılar*. Ü.Hacıbəyov. **Üstü yoxdur** – tayı-bərabəri, misli-bərabəri olmayan şey haqqında. *Burası var ki, sirr saxlamaqda üstü yoxdur, – deyə, Məşədibəy başı ilə təsdiq etdi*. S.Rəhimov. **Üstündə durmaq** – 1) fikrindən, təklifindən, sözündən əl çəkməmək, dönmədən müdafiə etmək, inad göstərmək. *Fikrinin üstündə durmaq. – Qarı sözünün üstündə durmuş və bu il iki qutu toxum götürmüşdü.* Ə.Sadıq; 2) müzakirə, götür-qoy, məsləhət nəticəsində bir çox şeydən, adamdan birini seçmək, birini bəyənmək. *Nəhayət, trest altımərtəbəli yaşayış evinin üstündə durmuşdu.* M.İbrahimov. **Üstündə zağ-zağ əsmək** – həddindən artıq əzizləmək, sevmək. *Ata-anası da, dayısı da Müşgünazın nazı ilə oynayar, onu əzizlər, üstündə zağ-zağ əsərdilər*. Ə.Vəliyev. **Üstündən ağır yük götürülmək** – üzərində olan ağır işdən qurtarıb azad nəfəs almaq, rahatlanmaq. *Sözü* [Rüstəm] *eşidən kimi sanki üstündən ağır bir yük götürüldü.* M.İbrahimov. **Üstündən bir daş!** – tamamilə unudulmalı, yaddan çıxarılmalı, bir daha maraqlanmamalı şey haqqında. **Üstündən dağ götürülmək** – ağır ruhi əzabdan, iztirabdan, yaxud qayğıdan qurtarmaq, narahatedici fikirdən azad olmaq. **Üstündən keçmək** – bənd olmamaq, əhəmiyyət verməmək, ağartmamaq. *Sualın üstündən keçmək.* **Üstündən qələm çəkmək** – yazılmış bir şeyi pozmaq, atmaq, çıxarıb atmaq. **Üstünə açılmaq** – üstünə qışqırmaq, acıqlanmaq. *Aslan Rüstəm kişinin Salmana acıqlı bir nəzər saldığını görüb, indicə onun üstünə açılacağını gözlədi*. M.İbrahimov. **Üstünə artırmaq** – b a x **üstünə qoymaq**. **Üstünə atmaq** – b a x **üstünə yıxmaq**. **Üstünə ayaqlanmaq (ayaq almaq)** – üstünə hücum etmək, qalxışmaq. [Badam xala:] *Yazılmasam, tay-tuş üstünə ayaq alar*. Mir Cəlal. [Qadın:] *Uşağım olsaydı, mən qoyardım ki, Mustafa mənim üstümə ayaq alsın?* E.Sultanov. **Üs-**

**tünə buzlu su tökmək** – bax **üstünə soyuq su tökmək**. **Üstünə düşmək** – 1) bir şeyi həyata keçirməkdə inad göstərmək, ona nail olmağa var qüvvəsi ilə çalışmaq; 2) üstünə hücum etmək, üzərinə atılmaq. *Sərhəd kazakları Əkbərin üstünə düşdülər.* “Qaçaq Nəbi”; 3) üstünə hücum etmək, danlamaq, məzəmmət etmək. *Kişi acığından Kərimin üstünə düşər və həyətdə qiyamət qopardı.* H.Sarabski. *Qayıdıb gələndə məclisdən geri; Yolda iki nəfər düşdü üstümə.* M.Rahim. *Qoca anası və körpə bacısı* [Şirzadın] *üstünə düşdü.* M.İbrahimov. **Üstünə əl qaldırmaq** – vurmaq, zərbə endirməyə hazırlaşmaq. **Üstünə fitləmək** *zar.* – bir adamı başqasının üstünə saldırmaq, vuruşmağa, sözləşməyə təhrik etmək. **Üstünə gülmək** – ələ salmaq, masqaraya qoymaq, lağa qoymaq. **Üstünə xoruzlanmaq** – şeşələnmək, xoruzlanmaq, kişilənmək, kəkələnmək. **Üstünə ildırım düşsün!** – qarğış mənasında işlədilir. [Fatma xanım:] *Ay səni öyrədənin üstünə ildırım düşsün!* N.Vəzirov. **Üstünə kəkələnmək (təpinmək)** – bax **üstünə xoruzlanmaq**. *Sarxan gözlərindən hiyləgərlik tökülən almanın üstünə təpindi.* M.Hüseyn. **Üstünə qoymaq** – şişirtmək, mübaliğə etmək, eşitdiyinin üstünə əlavə edərək başqasına danışmaq. [Səkinə Rüstəmə:] *Yeyib gedəcəklər, on beşini də üstünə qoyub danışacaqlar*. M.İbrahimov. **Üstünə (soyuq) su tökmək (ələmək)** – hirsini soyutmaq, sakitləşdirmək. **Üstünə su (soyuq su) ələnmək** – həvəsi qaçmaq, soyumaq. **Üstünə tökülmək** – üstünə hücum etmək, yerbəyerdən üzərinə atılmaq (kütlə halında). [Oba itləri] *uzaqdan kölgəmi görüncə sürü ilə üstümə tökülüb hürərdilər*. A.Şaiq. **Üstünə yıxmaq** – başqasının üzərinə yükləmək, onun boynuna qoymaq, ona isnad etmək. *İndi hamı bütün təqsirləri* [Seymurun] *üstünə yıxmağa çalışırdı*. H.Seyidbəyli. **Üstünü açmaq** – üzə çıxarmaq, faş etmək, ifşa etmək, aşkara çıxarmaq. **Üstünü almaq** – 1) qovub çatmaq, haqlamaq, çatıb yaxalamaq, çatıb tutmaq. [Xəlil:] *İki dəstədir... Az qalıblar üstümü alsınlar*. N.Vəzirov. [Veys:] *Hə, Zeynal! Başlayın, karxanalardan, mağazalardan mal oğurlanıb gizlədilməmiş, üstlərini almaq lazımdır.* Ə.Əbülhəsən; 2) tez özünü (özlərini) çatdırmaq, yanına gəlmək. *Şeyx Abuzərlə şeyx Mərvan həmən Sənanın üstünü alırlar.* H.Cavid. **Üstünü basdırmaq (pərdələmək, malalamaq)** – ört-basdır etmək, gizlətmək, gizli saxlamaq. [Səfər bəy Mirzə Turaba:] *Nə təhər olmuş olsun, gərək kəndlinin ölməyinin üstünü basdıraq*. B.Talıblı. **Üstünü ot basmaq** *məc.* – unudulub getmək, haqqında danışılmamaq, unudulmaq, xatirdən silinmək. **Üstünü vurmamaq** – haqqında danışmamaq, ört-basdır etmək, toxunmamaq, gizli saxlamaq. *Ancaq Qazan xan bunun üstünü vurmayıb, Yalınçağı yola saldı.* M.Rzaquluzadə. [Çiçək] *çox təəccübləndisə də, üstünü vurmadı.* B.Bayramov.

**ÜST-BAŞ** *is.* Paltar, pal-paltar, geyim. [Qumral:] *Anacan, sən qapını aç, mən gedim, üst-başımı qaydaya salım*. S.Rəhman. *Tofiqin üst-başı islanmışdı, özü də yaman qorxmuşdu*. M.Rzaquluzadə.

**ÜSTDƏN-AŞAĞI** *zərf* 1. Yuxarıdan-aşağıya, yuxarıdan-aşağıya enərək, başıaşağı. *Valentina isə oğlu ilə qızını ötərək üstdən-aşağı toplara sarı cumdu.* Ə.Əbülhəsən.

2. Başdan-ayağa, yuxarıdan-aşağıya. *Çox qəlbi yerdə dayanmış Tapdıq üstdən-aşağı müəllimə baxdı*. Ə.Vəliyev.

**ÜSTƏGƏL** *is. riyaz.* 1. Toplama əməlini və ya kəmiyyətin müsbətliyini göstərən işarə (+).

2. İki rəqəmin toplandığını göstərmək üçün onların arasında işlədilir. *Beş üstəgəl üç, səkkizə bərabərdir.*

**ÜSTƏGƏLMƏ** *is. riyaz*. Rəqəmləri bir-birinin üstünə gəlmə; toplama.

**ÜSTƏLƏMƏ** “Üstələmək”dən *f.is.*

**ÜSTƏLƏMƏK** *f.* Üstün gəlmək, qalib gəlmək, məğlub etmək. *Teymur sevinir ki, mollanı üstələyib*. “M.N.lətif.”

**ÜSTƏLİK** 1. *is.* Bir şeyin üstündə verilən şey; əlavə.

2. *zərf* Əlavə olaraq. [Rəsul] *gördü ki, bu zalımlar udduqları pullarla kifayətlənməyib, üstəlik yatdıqları yorğan-döşək və balışları da aparmışlar.* “Aşıq Qərib”. *Şairin qəzəllərinə məftun olmuş Dərbənd əmiri onu xaraba kənddən öz sarayına dəvət edirdi, üstəlik ən gözəl kənizini də ona hədiyyə göndərmişdi.* Ə.Məmmədxanlı.

**ÜSTQURUM** *is.* Cəmiyyətin siyasi, hüquqi, dini, bədii, fəlsəfi görüşləri və onun iqtisadi

quruluşunun – bazisinin bunlara müvafiq olaraq yaratdığı siyasi, hüquqi və s. təsisatların məcmusu.

**ÜSTLÜK** *is.* Bir şeyin üstünü örtməyə, üstünə çəkməyə məxsus şey. *Dəri üstlüyü.*

**ÜSTÜAÇIQ** 1. *sif.* Üstü örtülməmiş, üstü açıq olan; damı, qapağı olmayan; açıq. [Qoşatxan:] [Xəstəni] *üstüaçıq maşında xəstəxanaya aparmaq olmaz.* M.İbrahimov. [Məntəqənin] *qapı-pəncərələri və üstüaçıq taxta balkonları rənglənmişdi.* Ə.Sadıq. // *zərf* Üstünə heç bir şey örtmədən, üstünə heç bir şey salmadan. [Sultan bəy:] *Ay qız Telli, min kərə demişəm ki, mən yatanda gəl, mənim üstümü basdır, indi üstüaçıq yatmışam, deyəsən, belimə soyuq dəyibdir.* Ü.Hacıbəyov.

2. *zərf* Açıq surətdə, açıq, gizlətmədən. [Bəhlul:] *Nicat dayı məndən soyumuşdu, hərdən lap üstüaçıq şəkildə məni danlayırdı.* B.Bayramov.

**ÜSTÜN** *sif.* 1. Bənzərlərinə görə daha yaxşı, daha yüksək səviyyədə olan, onları geridə buraxan. [Ərəstun:] *Sənətkarlıqla yazılmış balaca bir şerin özü hər hansı sönük bir poemadan qat-qat üstündür!* S.Rəhimov. [Sərətan:] *Üstündür hələlik şair Xaqani; Odur söz mülkünün qadir sultanı.* M.Rahim. // Keyfiyyət və kəmiyyətcə daha yüksək, daha əlverişli olan. *Əl əldən üstün olar.* (Məsəl).

2. Qalib gələn, qələbə çalan, qalib. ☐ **Üstün gəlmək** – qalib gəlmək, qələbə çalmaq. [2-ci cariyə Səyavuş haqqında:] *Qəhrəmandır, üstün gəlir aslana!* H.Cavid. *Kərim baba sükutla başını tərpətdi. Ayrımqızı üstün gəldiyini hiss edərək özünü doğrultdu.* A.Şaiq. **Üstün tutmaq** – b a x **üstünlük vermək** (“**üstünlük**”də).

**ÜSTÜNLÜK** *is.* Bənzərləri arasında daha yaxşı, daha yüksək, daha əlverişli olma. *Ağbulaq dağlarının bütün gözəllik və üstünlükləri Sevildə unudulmaz .. bir təsir buraxdı.* S.Rəhimov. ☐ **Üstünlük vermək** – bir neçələri və ya çoxları arasından ancaq birini seçmək, onu daha yaxşı, daha münasib, daha yüksək, daha əlverişli hesab etmək, bəyənmək.

◊ **Üstünlük dərəcəsi** *qram.* – sifətin əlamət və keyfiyyətinin adi dərəcəyə nisbətən üstün olduğunu göstərən dərəcəsi; məs.: qıpqırmızı, ağappaq, lap tünd və s.

**ÜSTÜÖRTÜLÜ** 1. *sif.* Üstü örtülmüş, üstü açıq olmayan, örtüsü olan, örtülü. *Ancaq təktük üstüörtülü faytonlar içində miniklər görünürdü.* S.M.Qənizadə. *Üstü-örtülü, qara bir maşın gecənin sakitliyini pozdu.* S.Vəliyev.

2. *məc.* Aydın olmayan, örtülü, müəyyən olmayan, eyhamlı, üstüpərdəli. [Şamama Cadu:] *Üstüörtülü sözdən fayda yoxdur.* Ə.Haqverdiyev. // Zərf mənasında. *Üstüörtülü danışmaq.* – [Əliqulu:] *Yaxşı, baxarıq! – deyə, üstüörtülü bir cavab verib ayrıldım.* S.Rəhman.

**ÜSTÜPƏRDƏLİ** b a x **üstüörtülü** 2-ci mənada.

**ÜSTÜRLAB** *is.* [*ər.* əsli *yun.*] Keçmişdə göy cisimlərini müşahidə etmək üçün işlədilmiş astronomik cihaz. *Kimi pərgar ilə həndəsi şəkillər çəkər, kimi durbinlə yan pəncərədən Günəşə baxar, kimi üstürlabla və bəziləri də kitab oxumaqla məşğuldurlar.* H.Cavid. *Məlik əlində uydurma üstürlab saray xidmətçisi Məstur ilə danışır.* A.Şaiq.

**ÜST-ÜSTƏ** *zərf* 1. Bir-birinin üstünə, qalaq-qalaq. *Rəflərdə pas atmış mis qablar üst-üstə yığılmışdı.* Çəmənzəminli. *Ana sacı külləyib ocaq qalayır, kətə bişirib içinə təzə yağ qoyur, isti qalması üçün üst-üstə yığır, süfrə ilə bərk-bərk basdırırdı.* Ə.Vəliyev.

2. Birlikdə götürüldükdə, hamısı bir yerdə, birlikdə. *Üst-üstə hamısını bir kisəyə yığmaq.*

3. Əl dəymədən, olduğu kimi, əvvəlki kimi, necə var elə. [Mahmud:] *İndi-indi işə başlamışam, üst-üstə qoyub qaçım ki, nə var külfətimə yaxın olmaq istəyirəm.* Y.Əzimzadə.

**ÜSUL** *is.* [*ər.*] 1. Hər hansı işdə tətbiq edilən sistem, yol, qayda, tərz, metod. *Qabaqcılların iş üsulu. Tədris üsulu.* – [Sərdaroğlu] *şagirdləri tez-tez zavoda aparıb istehsalatla, yeni üsullarla işləyən ustaların işləri ilə tanış edirdi.* H.Seyidbəyli. [Daşdəmir] *Hümmətin plan doldurma üsullarından maraqlı şeylər demişdi.* B.Bayramov.

2. Təbiətdə və ictimai həyatda baş verən hadisələri dərk və təsdiq etmə qaydası; metod. *Dialektik üsul. Tarixi-müqayisəli üsul.*

3. Tərtib, nizam, qayda.

**ÜSULCA, ÜSULLUCA** *zərf* Ehtiyatla, üsulla, asta-asta, yavaşca, ehmalca. [Məcid əfəndi:] *Üsulluca hərəkət etməliydin.* H.Cavid.

**ÜSULİ-CƏDİD** *is.* [*ər.*] *köhn.* Yeni üsul, yeni qayda. *O vaxt üsuli-cədidə bələd olan müəllim bir nəfər isə də müsəlmanlardan yox idi.* F.Köçərli. □ **Üsuli-cədid məktəbi** *tar.* – 1905-ci il inqilabından sonra Azərbaycanın müxtəlif şəhərlərində açılan yeni tipli məktəbin adı. *Günlərin bir günündə Dəcəlabad marallarım məclis qayırıb qət edirlər ki, bir üsuli-cədid məktəbi açsınlar.* Ə.Haqverdiyev. [Tahirzadə:] *Kəndli uşağına məktəb lazımdır, üsuli-cədid məktəbi.* Mir Cəlal.

**ÜSULİ-İDARƏ** *is.* [*ər.*] Bir ölkənin idarə üsulu, dövlət quruluşu, rejim. *Çar üsuli-idarəsi. Xalq demokratik üsuli-idarəsi. – Bizim üsuli-idarədə fitnə-fəsada yol verilməz, – deyə, Nadir dayısına* [cavab verdi]. B.Talıblı.

**ÜSULLU** 1. *sif.* Ehtiyatlı, ehmallı, üsulla, ehtiyatla işgörən, hərəkət edən. *Üsullu adam. Üsullu hərəkət.*

2. B a x **üsulluca**. [Hacı Murad:] *Ay ayı oğlu ayı, üsullu tərpənə bilmirsən?* S.S.Axundov.

**ÜSYAN** *is.* [*ər.*] 1. Köhnə ictimai quruluşu yıxıb yenisini qurmaq məqsədilə hakim siniflərə qarşı kütləvi silahlı çıxış. *Kəndli üsyanları. – Bir üsyanla doğacaqdır azadlığın ilk ulduzu!* S.Vurğun. *Aydın olsun hamıya; Xalqın gücü; Silahlı üsyanın nəticəsi.* R.Rza. □ **Üsyan etmək (qaldırmaq)** – hakim siniflərə qarşı silahlı çıxış etmək. *Üsyan etmiş kənd topa tutulur.* H.Nəzərli.

2. Asi olma, qarşı durma, birinə qarşı ayaqlanma, baş qaldırma. □ **Üsyan etmək (qaldırmaq)** – ayaqlanmaq, üzə durmaq, asi olmaq, baş qaldırmaq. *Bir gün Məsmə üsyan edir. Kimsəyə əl açmayacağını açıqdan-açığa kor Seyidə bildirir.* S.Hüseyn. *Səkinə lap üsyan qaldırdı: – Yenə qol-qanad açdın, ay dəli?!* M.İbrahimov.

**ÜSYANÇI** *is.* 1. Üsyanda iştirak edən, üsyan iştirakçısı. [Qəhrəman:] *Gah bizim qoşun, gah da üsyançılar qalib gəlirdilər.* H.Nəzərli. [Komandan:] *Məqsəd xalqı qırmaq deyil, üsyanı yatırdıb, üsyançıları ələ gətirməkdir.* Ə.Haqverdiyev.

2. *məc.* Haqsızlığa və ya bir şeyə dözməyib, öz narazılığını, hiddətini fəal surətdə bildirən adam; üsyankar. *İndi* [Muradda] *mühitinə qarşı bir üsyançı ruhu vardı.* S.Hüseyn.

**ÜSYANÇILIQ** *is.* Üsyana meyil göstərmə, bir şeyə qarşı haqlı-haqsız baş qaldırma, qarşı durma.

**ÜSYANKAR** [*ər.* üsyan və *fars.* ...kar] 1. B a x **üsyançı**. [Kapitan qərargah rəisinə:] *Biz .. üsyankarları taparıq.* S.Vəliyev.

2. *sif.* Narazılıq, qəzəb, hiddət ifadə edən. *Üsyankar baxış. – Firidun Musa kişinin üsyankar bir sifətlə Hikmət İsfahaninin qabağında durduğunu gördü.* M.İbrahimov.

**ÜSYANKARLIQ** *is.* 1. Üsyançılıq, üsyana meyil.

2. *məc.* Bir şeyə qarşı baş qaldırma, mənfi münasibət, narazılıq, barışmazlıq göstərmə. *Ani olaraq Rüxsarədə yenə də əsəbi bir üsyankarlıq baş qaldırmaq istəyirdi.* S.Rəhimov.

**ÜŞÜDÜCÜ** *sif.* Üşüdən, soyuq, dondurucu. *Sonra sərin, üşüdücü dərəcədə sərin bir meh əsdi.* M.Rzaquluzadə.

**ÜŞÜMƏ** "Üşümək"dən *f.is.*

**ÜŞÜMƏK** *f.* 1. Canına üşütmə düşmək, bədənində soyuğun təsirini hiss etmək, soyuqdan titrəmək. *Ləhləyirlər, tərləyirlər, əl-üzləri qızarmış; Bir parası çox üşüyür, əl-üzləri bozarmış.* A.Səhhət. *Soyuq yel əsməyə başladı. Zəhra üşüdü.* Ə.Vəliyev.

2. *məc.* Donuşmaq, soyuqdan büzüşmək. *Ay külək, dərədən iti əsmə, gəl; Axı tənha qovaq üşüyür orda.* N.Xəzri. *Üfüqdən uzanmış şüalar altında parlayan körpə payız otları üşüyürmüş kimi titrəşirdi.* İ.Əfəndiyev.

**ÜŞÜNMƏ** "Üşünmək"dən *f.is.*

**ÜŞÜNMƏK** b a x **üşümək**. *Üşünürsən, görürəm, söylə nə var?* M.Rahim.

**ÜŞÜTMƏ** 1. "Üşütmək"dən *f.is.*

2. Titrətmə, vicvicə. *Canıma üşütmə düşdü.* – [Nemət] *bir az dincəldikdən sonra bədəninə bir üşütmə gəldi ki, köynəyi tamamilə soyudu.* Çəmənzəminli.

**ÜŞÜTMƏK** *f.* Canına üşütmə salmaq, soyuğu hiss etdirmək. *Soyuq hava* [Tərlanı] *birdən üşütdü.* M.Hüseyn. *Çayaşağı əsən bu külək bütün kolxozçuları üşütdü və titrətdi.* Ə.Vəliyev.

**ÜŞŞAQ** *is.* [*ər.* "aşiq" söz. cəmi] 1. *klas.* Aşiqlər. *Əzəl katibləri üşşaq bəxtin qarə yazmışlar.* Füzuli. *Üşşaq yardan nəzəri-mərhəmət dilər.* Q.Zakir.

2. *mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *Şair .. yerinə görə həm dərin*

*məhəbbətdən, həm də insana zövq verən üşşaq muğamından danışır.* "İncəsənət".

**ÜTƏLGƏ** *is. zool.* Alacəhrə. *Gəlib ütəlgətək düşələr tora; Yolub tüklərini basdıraq qora.* H.K.Sanılı.

**ÜTMƏ** "Ütmək"dən *f.is.*

**ÜTMƏK** *f.* Qızğın dəmirlə və ya oda tutaraq üzdən yandırmaq, qarsalamaq, oda vermək (tükü, qabığı və s.-ni). *Kəsilmiş toyuğu ütmək. – Ev sahibi burada cavan şiv zirinc ağacından qırıb gətirər, ocaqda ütüb çəkiclə döyər, özü üçün lopa düzəldərdi.* S.Rəhimov. // Yolmaq.

**ÜTÜ** *is.* Paltar, parça və s. ütüləmək üçün işlədilən, kömür və ya elektriklə qızdırılan dəmir alət. *Elektrik ütüsü.* ☐ **Ütü çəkmək** – bax **ütüləmək**. *Xanpəri çay dəmlədikdən sonra dünən yuyulmuş paltarlara ütü çəkirdi.* Ə.Vəliyev. [Sona] *paltarına ütü çəkir, düymələrini bərkidirdi*. B.Bayramov.

**ÜTÜK** *sif.* Üzdən yanmış, azacıq yanmış, ütülmüş, yaxud yolunmuş. *Qulu dolu ağzını çöndərib, ütük qaşlarını qovzuyub .. nə deyəcək idisə, beş-altı yerdən onun sözünü kəsib çığırışdılar*. Çəmənzəminli.

**ÜTÜLƏMƏ** "Ütüləmək"dən *f.is.*

**ÜTÜLƏMƏK** *f.* Qızğın ütü ilə hamarlamaq, ütü çəkmək. [Pəri] *geri sürüşmüş qara kəlağayısını qabağa çəkib, paltar ütüləməklə məşğul oldu*. Ə.Vəliyev. [Səriyyə:] *Mən ütü qızdırıb buldozerçinin köynəyini ütüləyirdim*. İ.Əfəndiyev.

**ÜTÜLƏNMƏ** "Ütülənmək"dən *f.is.*

**ÜTÜLƏNMƏK** *məch.* Ütü ilə hamarlanmaq, ütü çəkilmək.

**ÜTÜLƏNMİŞ** *f.sif.* Ütü çəkilmiş, ütü ilə hamarlanmış. [Pəri] *təzə yuyulub ütülənmiş məhrəbanı yerindən asdı*. Ə.Vəliyev.

**ÜTÜLMƏ** "Ütülmək"dən *f.is.*

**ÜTÜLMƏK** *məch*. Qızğın dəmirlə və ya oda tutaraq üzdən yandırılmaq (tük, qabıq və s.). // Qarsaqlanmaq, azacıq yanmaq. [Yaqutun] *bütün üzü qara ləkələr içində idi, saçları və qaşları ütülmüşdü, gözləri isə qapalı idi.* Ə.Məmmədxanlı. // Yolunmaq.

**ÜTÜLMÜŞ** *f.sif.* Tükləri yandırılıb təmizlənmiş. [Xuduş] *əlinə də bir ütülmüş toyuq götürmüşdü*. Ə.Sadıq.

**ÜTÜLÜ** *sif.* Ütü çəkilmiş, ütülənmiş. *Daxiliyyə naziri ütülü ağ dəsmalını çıxarıb boyunboğazından sel kimi axan təri sildi.* S.Rəhimov.

**ÜTÜSÜZ** *sif.* Ütü çəkilməmiş, ütülənməmiş. *Baxışın geyim-keçimdə səliqəli olduğunu Qaçay bilirdi. Ütüsüz şalvar geyinməzdi.* İ.Məlikzadə.

**ÜVƏZ** *bot.* bax **quşarmudu**. *Üvəz soyuğadavamlı bitkidir.*

**ÜYÜDÜLMƏ** "Üyüdülmək"dən *f.is.* [Ağabəyim] *çörəyin bişirildiyini bilirdi, ancaq buğdanın bitməsini və dəyirmanda üyüdülməsini bilmirdi*. Çəmənzəminli.

**ÜYÜDÜLMƏK** *məch*. Dəyirmanda una çevrilmək (buğda, arpa və s.); çəkilmək. [Murad] *üyüdülməyə toplanan taxıl bitdiyindən motoru yatırıb dışarı çıxdı.* S.Hüseyn.

**ÜYÜŞMƏ** "Üyüşmək"dən *f.is.*

**ÜYÜŞMƏK** bax **uyuşmaq** 1-ci mənada. [Xan] *tonqal başında uzun müddət qımıldanmadan oturmaqdan üyütmüş* (f.sif.) *ayaqlarında bir gizilti, bədəninin hər yerində sızıltı duydu*. M.Rzaquluzadə.

**ÜYÜTMƏ** "Üyütmək"dən *f.is.*

**ÜYÜTMƏK** *f.* 1. Dəyirmanda buğda, arpa və s.-ni una çevirmək; çəkmək. *Buğda* (*arpa*) *üyütmək. – Cəfər tayları içəri qoydu, az keçmədən dəni üyütməyə başladı.* Ə.Vəliyev.

2. *məc. dan*. Boş-boş danışmaq (bəzən **üyüdüb-tökmək** şəklində). *Şirəli yenə bağırdı: – Uzun danışma, ağzını avara qoyub ağlına gələni üyütmə.* M.Hüseyn. *Heç kimə macal verməyən Vahimə üyüdüb-tökürdü*. B.Bayramov.

**ÜZ** *is.* 1. İnsan başının qabaq hissəsi; surət, sifət, çöhrə, sima. *Üzünün ifadəsi. Qəşəng üz. – Mərcan bəy diqqətlə Kərbəlayı Qubadın üzünə baxır*. Ü.Hacıbəyov. [Qızın] *yumru, gözəl üzü və yanaqları açıq sərin havada qızarmışdı*. M.İbrahimov. // Heyvan başının qabaq hissəsi. *Qoyunun üzü. İtin üzü.*

2. Toxunma şeylərin üst (avand) tərəfi (*astar* müqabili). *Parçanın üzü. Xalçanın üzü.* // Yorğan, balış, döşək və s.-nin üst tərəfini örtən parça və s. *Yorğanın üzü qırmızıdır. Döşəyə üz çəkmək*. – [Gülbadam] *üzsüz boz balışı, üzü qırmızı çiçəkli çitdən mütəkkəli döşəyin ortasına qoydu.* N.Nərimanov.

3. Bir şeyin qabaq tərəfi, ön tərəfi, irəli tərəfi, qabağı, önü. *Maşının arxası çaya, üzü*

*isə meşəyə tərəf idi*. İ.Əfəndiyev. // Bir tikilinin, binanın və s.-nin qabaq, ön tərəfi; fasad. [Elçin:] *Sarayın üzü gündoğana tikiləcək*. Z.Xəlil. *Təki ayaq kəsməsin könül mülkündən ilham; Üzü günəşə baxan otağım mənə bəsdir*. Ə.Cəmil.

4. *riyaz*. Həndəsi fiqurun başqa səthlə bucaq təşkil edən düz səthi. *Kubun altı üzü var*.

5. Bir şeyin köçürülmüş, yazılmış surəti, nüsxəsi. *Firdovsi şaha göndərdi bir gün "Şahnamə"nin üzünü*. M.Rahim. ☐ **Üzünü köçürtmək** – bir yazının mətnini olduğu kimi başqa kağıza köçür(t)mək, başqa kağızda yazmaq. [Zalxa:] *Eybi yoxdur, bizim qızlardan birinə verərəm, üzünü köçürdərlər*. S.Rəhman. [Vahid] *..kitabların üzünü köçürür, qaralanmış vərəqləri ağardırdı*. Mir Cəlal.

6. Su və s. mayelərin səthi, üst tərəfi, üstü. *Gölün üzü. Suyun üzündə ördəklər üzür. – Bu gecə keçmişi vurduq, yıxdıq; Dalğalardan üzə sağlam çıxdıq*. M.Müşfiq. *Gen qoynunda layla çalır bizə göy dəniz; Su üzündə bir qayadır sanki gəmimiz*. Ə.Cəmil.

7. Göyün biz gördüyümüz tərəfi. *Göyün üzünü bulud örtmüşdür. Səmanın üzü açıqdır. – Toz-torpaq göyün üzünü elə bürümüşdü ki, günəş görünmürdü*. A.Şaiq. ☐ **Üzünə pərdə çəkmək** – örtünmək, bir şeyin altında görünməz hala gəlmək, gizlənmək. *Deyirlər, göylər belə; Üzünə pərdə çəkmiş*. B.Vahabzadə.

8. "Tərəf", "səmt", "yan" mənasında (o, bu, bəri, o biri və s. sözlərdən sonra işlədilir). *Təpənin o üzü. Çayın bu üzü. – Atlar tapılmadıqda* [Gülo] *at sahiblərini inandırırdı ki, atlar bu üzdə deyil*. S.Rəhimov.

9. *məc*. Abır, həya, utanma. *Adamda üz gərək*.

◊ **Üz açılmaq** – b a x **üzü gülmək**. *Hər yerdə sülh sözünü deyəndə gözlər işıqlanır, üzlər açılır*. M.İbrahimov. **Üz ağartmaq** – yaxşı işi, nəcib hərəkəti, etimadı doğrultmağı və s. ilə fəxr etməyə, iftixar etməyə əsas vermək, hüquq vermək. *Yaxşı iş üz ağardar*. (Ata. sözü). [Briqadir:] *Demək, əvvəlki işində üz ağardıb, indi də keçibsən başqa işə?* V.Şıxlı. **Üz ağlığı** – fəxr etməyə, iftixara layiq olan iş, hərəkət və s. *Yaxşı övlad üz ağlığıdır*. **Üz almaq** – keçmişdə: qadınların eşmə sapla üzlərinin tüklərini yolub təmizləməsi. **Üz bozartmaq** – b a x **üzünü bozartmaq**. **Üz çevirmək** – 1) b a x **üz döndərmək** 1 və 3-cü mənalarda; 2) b a x **üz qoymaq** 1-ci mənada. *Gülgəz dəli olub, yoxsa divana? Üz çevirib gedər çöl-biyabana*. Aşıq Abbas; 3) birini görməmək üçün üzünü o biri tərəfə çevirmək. *Sənəmin qarşısından keçəndə hamı ondan üz çevirir*. M.Dilbazi; 4) əlaqəsini kəsmək, üz döndərmək. [Bəhram:] *Belə bir vücuddan* [Saradan] *da üz çevirmək olarmı?* C.Cabbarlı. *Nə oldu, üz çevirib qaçdın aqibət məndən*. H.Cavid. **Üz çevirməmək** – bir yerə daha getməmək, ayağını üzmək. *Səməd, doğrudan da, o gedən gedib, bir daha dəlləkxanaya üz çevirmədi*. M.Hüseyn. *Son illərdə bir neçə basqında burunları yaxşıca ovulmuş qıpçaqlar çoxdan bəri buralara üz çevirmirdilər*. M.Rzaquluzadə. **Üz döndərmək** – 1) əlaqəsini kəsmək, daha yaxınlıq etməmək, üz çevirmək. *Dal gərdəndə siyah zülfün hörübdür; Aşıq Ələsgərdən üz döndəribdir*. Aşıq Ələsgər. *Nə üçün, bilməyirəm, məndən üz döndərmisən?* M.Rahim; 2) *məc*. xəyanət etmək, daha inanmamaq, üz çevirmək. *Üləmalar üz döndərib xudadan*. Q.Zakir; 3) itaətindən çıxmaq, daha tabe olmaq istəməmək, dal çevirmək. [Əxistan:] *Məndən üz döndərir getdikcə Şirvan; Aşkara öldürsəm baş verər üsyan*. M.Rahim; 4) çevrilmək, başını çevirmək. *Sonra üz döndərib meydana baxdı; Tərlan yaralanmış tərlana baxdı*. M.Rahim. **Üz gətirmək** – nadinclik etmək, sırtıqlıq etmək. **Üz görmək** – tərəf saxlamaq, tərəfgirlik etmək, havadarlıq etmək. *Yalan deyən, rüşvət alan, tərəf tutan, üz görən! Dərdimizə qalmayanlar çıxsın bizim cərgədən!* S.Vurğun. [Məhbus:] *Qoy qanun nə tələb edirsə onu yazsın, yoldaşıyam deyə mənə üz görməsin*. Mir Cəlal. **Üz göstərmək** – 1) zahirən bu və ya başqa cür münasibət göstərmək. *Xüsusilə Mayaya göstərdiyi üz, dediyi sözlər yadına düşəndə Qaraş əzabdan qovrulub yanırdı*. M.İbrahimov; 2) b a x **üz vermək** 2-ci mənada. **Üz götürüb qaçmaq** – b a x **baş götürüb qaçmaq**. *Bu mənada Məşədi Əsgər öz əməlinin qorxusundan quzu qapmış qurd kimi üz götürüb qaçırdı*. S.M.Qənizadə. **Üz qoymaq** – 1) yönəlmək, üz tutub getmək, yollanmaq, istiqamət almaq. *Bəli, atları gətirdilər və minib, Təbrizdən*

*çıxıb üz qoyduq Araz kənarına tərəf hərəkət etməyə.* C.Məmmədquluzadə. *Balıqçı gəmisi lövbərini qaldırıb, şimala tərəf üz qoydu.* Q.İlkin; 2) adətən feillərdən sonra gələrək həmin felin ifadə etdiyi hərəkətə, işə başlamağı ifadə edir. *Bunu gördükdə adamlar bir-birini basaraq yan küçələrə qaçmağa üz qoydu*(*lar*). S.S.Axundov. *..Abbas birdən harada olduğunu, kiminlə danışdığını yaddan çıxarıb qışqırmağa üz qoydu.* Ə.Vəliyev. **Üz tutmaq** – 1) söz demək üçün üzünü birinə tərəf çevirmək, üzünü çevirərək demək. *Rəşid oğlana üz tutdu: – Səni qulluğa götürmək mənim boynuma.* M.Hüseyn; 2) b a x **üz qoymaq** 1-ci mənada. *Qərib-qərib, qəmgin-qəmgin ötərsiz; Yüz tutubsuz nə məkana, durnalar?* M.V.Vidadi. *Cəlil ağa düz evə üz tutdu.* İ.Musabəyov; 3) başlamaq. *Qurumağa üz tutmuş ağaclar su içib cana gəldi, torpaq tərləməyə, nəfəs almağa, yenidən dirçəlməyə başladı.* Ə.Məmmədxanlı. **Üz vermək** – 1) vaqe olmaq, ortaya çıxmaq, baş vermək, olmaq; təsadüf etmək, birinin başına gəlmək. *Bədbəxtlik üz vermək. – Demək, evlənmək istədiyi günlər ərəfəsində* [Əsədə] *xoşbəxtlik üz vermişdi.* S.Vəliyev; 2) adətən xoşagəlməz bir işi görməsinə mane olmamaq, bu işə laqeyd baxmaq, ona şərait yaratmaq, xoş sifət göstərmək. [Hacı:] *Qayınanalarınıza çox da üz verməyin.* Qantəmir. *Şahmar* [Zülfüqarla] *dərdləşmək, dağılan əməkgünlərindən danışmaq istədi, ancaq hesabdar üz vermədi.* B.Bayramov; 3) hücum etmək, üstünə cummaq. *Canavar üz verdi sürüyə.* **Üz vurmaq** – 1) bir işi görməyi və ya görməməyi dostcasına, yoldaşcasına tələb etmək, xahiş etmək, israr etmək. *Xahiş edirəm, üz vurmayasınız, sizinlə gedə bilməyəcəyəm;* 2) *dan*. yeşik və s.-yə yığılan meyvənin yaxşısını üzünə düzmək. *Pomidor yeşiyinə üz vurmaq. Üzüm səbətinə üz vurmaq.* **Üzə çıxarmaq** – 1) meydana çıxarmaq, tapmaq. [Əmiraslan baba:] *Bu Ağbulaq meşələrində .. azı yüzə qədər çeşmə tapıb, qayalardan, çınqıllardan üzə çıxarmışam.* S.Rəhimov; 2) *köhn*. qeyri-qanuni, gizli vəziyyətdən çıxararaq adi həyata qaytarmaq. *Qaçağı üzə çıxarmaq.* **Üzə çıxmaq** – 1) daha gizlənməyib açıq yaşamağa başlamaq (qaçaq, cani, oğru və b. haqqında). [Bəkir:] *Ev-eşiyimiz bərbad olub, var-yoxumuz gedəndən sonra üzə çıxıb nə edəcəyik.* N.Vəzirov. *Oğrular üzə çıxdılar. Amma onlar Kor Hümmətin tapşırığı ilə İskəndərin əleyhinə şəhadət verdilər.* M.Hüseyn; 2) *dan.* öz bacarığı, qabiliyyəti və s. müsbət xüsusiyyətləri sayəsində irəli getmək, həyatda, cəmiyyətdə özünə layiq yer tutmaq. *Dəmirov rayonda adamların üzə çıxmağına, irəliyə getməyinə sevinən və bu uğurda çalışan bir adamdır.* S.Rəhimov; 3) aşkara çıxmaq, aşkar olmaq, müəyyənləşmək, məlum olmaq. *Kimin yaxşı, kimin pis işlədiyi çox tez üzə çıxır;* 4) adamlar arasına çıxmaq, gözə görünmək. *Gözəllər içində, xublar yanında; Üzə çıxa bilməz xəcalətindən.* Q.Zakir. **Üzə durmaq** – 1) inad etmək, öz dediyindən, tələbindən əl çəkməmək. *Bağça barın istəyir; Heyva, narın istəyir; Oğlan üzə durubdur; Getmir, yarın istəyir.* (Bayatı); // məc. mənada. *Gecə də üzə durmuşdu, işıqlanmırdı ki, işıqlanmırdı.* Ə.Vəliyev; 2) itaətdən çıxmaq, inad göstərmək. *Kütlə durub bu gün üzə; Ver bizə bir hesab deyir.* Ə.Nəzmi. [Əxistan:] *Budur, bir kəndli də məmuru vurmuş; Bu, vergi istəmiş, o üzə durmuş.* M.Rahim. **Üzə gülmək** – 1) öz gözəlliyi, cazibədarlığı və s. ilə xoşlandırmaq, oxşamaq, xoşa gəlmək, cəzb etmək. *Yeni binalar üzə gülür.* – [Xalçanın] *xüsusi zövqlə vurulan naxışları bahar çiçəyi kimi üzə gülürdü.* (Qəzetlərdən); 2) yalandan üzdə özünü dost göstərmək, yalandan xoş sifət göstərmək. [Əsma xanım:] *Üzə gülən imiş o qəlbiqara; Hardan meyil verdim o biilqara.* "Lətif şah". **Üzə qabarmaq (qayıtmaq)** – cavab qaytarmaq, üzə durmaq; itaətdən çıxmaq. *Hümmət, arvadın da üzə qayıtdığını görüb geri çəkildi.* B.Bayramov. **Üzə salmaq** – b a x **üzünə salmaq**. [Yalınçağın] *indi işi-peşəsi .. üzə salıb, hər gün bir qapıda qarın otarmaq idi.* M.Rzaquluzadə. **Üzə vermək** – göstərmək, bildirmək, büruzə vermək. *Narazılığını üzə vermək.* **Üzə vurmamaq** – ürəyində olan, yaxud gördüyü, bildiyi bir şeyi deməmək, bildirməmək, hiss etdirməmək. [Şirəlinin] *ürəyinə balaca xal düşdüsə də, üzə vurmayıb dedi.* S.Rəhman. **Üzü ağ çıxmaq** – bəslənilən ümidi, tapşırılan işi namusla yerinə yetirən adam haqqında.

**Üzü ağ olmaq** – yaxşı işinə, əməlinə, təmizliyinə görə fəxr etməyə layiq olmaq; etimadı doğrultmaq. [Müəllim Hüseynə:] *Yaxşı oxu, adam ol, bizim də üzümüz ağ olsun, ananın da*. S.Rəhman. *Qız ona qulaq oldu; Dil oldu, dodaq oldu; Anasının yanında; Hər vaxt üzü ağ oldu.* M.Dilbazi. **Üzü astarından baha başa gəlmək (oturmaq)** – b a x **astarı üzündən baha başa gəlmək** (“**astar**”da). **Üzü dönmək** – b a x **üz döndərmək** 1 və 2-ci mənalarda. *Gəl, ey mehrü məhəbbətim; Üzün məndən niyə döndü!* Aşıq Ələsgər. *Bizi görcək yan keçirsən; Niyə üzün dönüb sənin?* Aşıq Şəmşir. **Üzü gəlməmək** – bir şeyi deməyə, istəməyə utanmaq, xəcalət çəkmək. [Molla:] *Daha başqa mükafat istəməyə üzüm gəlmir.* “M.N.lətif.” *Yalan deməyə də* [Səfər kişinin] *üzü gəlmədi*. Mir Cəlal. **Üzü gülmək** – sevinci üzündən bəlli olmaq. *Üzü gülür hər insanın; Banisi var bu dövranın*. Aşıq Şəmşir. **Üzü gülməmək** – həmişə qaşqabaqlı olmaq, üzü kədər ifadə etmək. *Bu gündən sonra mehriban Soltanın üzü gülmədi, könlü qəmli, gözləri nəmli oldu, saralıb solmağa başladı.* “Lətif şah”. **Üzü qara etmək** – xəcalətli etmək. **Üzü(n) ağ olsun!** – çox vaxt töhmət, məzəmmət, narazılıq məqamında işlədilir. *Qubad gecəni yatıb, səhər tezdən qardaşına bir belə kağız yazdı ki: qardaş, üzün ağ olsun, sənin Siracın bizim börkümüzü soxdu yerə*. (Nağıl). **Üzü(n) qara olsun** – nifrət, danlaq, məzəmmət bildirən ifadə. *Pis övladın üzü qara olsun!* – [Rüstəm bəy:] *Mənim qızım Məşədi İbadın tayı deyildir, amma nə eyləmək, pulsuzluğun üzü qara olsun!* Ü.Hacıbəyov. *Yoxsulluğun üzü qara olsun!* S.Rəhimov. **Üzümüzə gələn** – qarşıdakı. *Üzümüzə gələn bayram*. **Üzün qara olsun!** – qarğış, danlaq məqamında işlədilir. [Zərnigar xanım:] “*Səni görüm el içində xəcil olasan, ay kişi, oğul-uşaq yanında üzün qara olsun*”, – *deyə ərinə qarğayırdı*. İ.Şıxlı. **Üzündə abır (həya, abır-həya) olmamaq** – həyasız, utanmaz, ədəbsiz adam haqqında. **Üzündə su yoxdur** – həyasız, abırsız adam haqqında. **Üzündə yazılıb (yazılmışdır)** – üzünə baxdıqda aydın olur, üzünə baxan kimi məlum olur. **Üzündəki qırış (qırışlar) açılmamaq** – b a x **üzü gülməmək**. **Üzündən gəlməmək** – b a x **üzü gəlməmək**. [Cəmilin] *üzündən gəlmirdi ki, nənəsini çağırsın, yenə də əliboş döndüyünü bildirsin*. S.Rəhimov. **Üzündən keçə bilməmək** – yaxın dost və ya hörmətli bir şəxs olduğuna görə xahişini, sözünü yerə sala bilməmək. *Lakin* [Rüstəm] *Şərəfoğlunun üzündən keçə bilmirdi, kişi hörmətə layiq adam idi*. M.İbrahimov. **Üzündən qan qaçmaq** – üzünün rəngi saralmaq, üzünün qanı çəkilmək. [Uşağın] *üzündən qan qaçıb, meyit rənginə dönmüşdü*. S.S.Axundov. **Üzündən oxumaq** – üzündən, üzünün ifadəsindən bilinmək, məlum olmaq, bəlli olmaq. *Onun ürəyindəkiləri üzündən oxumaq olur. – Gülnaz Aqilin baxışlarından sanki onun ürəyindən nələr keçdiyini üzündən oxuya bildi.* Q.İlkin. **Üzündən zəhər tökülmək (yağmaq)** – çox hirsli, acıqlı, qaşqabaqlı, üzügülməz adam haqqında. [Hacı:] *Bu nə halətdir, Ağa dərviş, yenə üzündən zəhər tökülür?* N.Vəzirov. **Üzünə ağ olmaq** – itaətindən çıxmaq, tabe olmamaq, üzünə qabarmaq. [Allahqulu:] *Ağa, başına dönüm, böyüyün üzünə ağ olma!* N.Vəzirov. [Bayrama] *elə gəlirdi ki, Gülsabah atasının üzünə ağ olmaz*. Ə.Vəliyev. **Üzünə baxan (baxsa) kəffarə verməlidir (gərək kəffarə versin)** – çox çirkin, kifir adam haqqında. **Üzünə bir batman darı töksən biri (birisi) də yerə düşməz** – üzü çopur adam haqqında. **Üzünə (dik, şax) demək (söyləmək)** – birisinin nöqsanını və ya onun haqqındakı fikri və s.-ni dalınca deyil, özünə demək. *Qəlbində kin və küdurət saxlayan deyildi, açıqsözlü idi, ərindən çəkinməyib hər sözünü onun üzünə dik söylərdi.* E.Sultanov. [Serjant:] *Sözü dik adamın üzünə deyəndir*. Mir Cəlal. **Üzünə durmaq** – 1) ibtidai istintaqda və ya məhkəmə prosesində birisinin təqsirini, cinayətini özünə demək. *Şahid müttəhimin üzünə durdu. Mütəzərrir müqəssirin üzünə durdu;* 2) b a x **üzünə ağ olmaq**. [Fatma xanım:] *Allah, gör mən nə günə düşmüşəm ki, bu kürd gədəsi də üzümə durubdu!* N.Vəzirov. [Məşədi İbad:] *Rəhmətlik Pərzada günlərin bir günü bir şillə çəkdim ki, bir dişi sındı, o idi ki, sonra bir kərə olsun üzümə durmadı*. Ü.Hacıbəyov. **Üzünə ələk (dəsmal, pərdə) tutmaq** – yalandan özünü utancaq kimi göstərmək. **Üzünə gül-**

**mək** – xoşuna gəlmək, cəlb etmək. *Ağ lavaşlar da süfrəyə sərilib, adamın üzünə gülürdü.* E.Sultanov. [Əsgər:] *Bu ev, bu həyat, bu yol – hamısı elə bil ki, üzümə gülür*. Ü.Hacıbəyov. **Üzünə gün doğmaq** – xoşbəxt yaşamağa başlamaq, taleyi gülmək, bəxti açılmaq, fərəhlənmək. *Qorxmaz evə gələndə elə bil qardaşı ilə bacısının üzünə gün doğar, evləri fərəh və nəşə ilə dolardı.* Ə.Vəliyev. **Üzünə qabarmaq (qayıtmaq)** – b a x **üzə qabarmaq (qayıtmaq)**. *Etiraz Mayanı boğurdu, lakin bu qədər adamın içində Rüstəm kişinin üzünə qayıda bilmirdi*. M.İbrahimov. **Üzünə qan səpilmək (çilənmək)** – hirsindən üzü qızarmaq. [Mimrənin] *üzünə qan səpildi*. Çəmənzəminli. **Üzünə pərdə çəkmək** – maskalanmaq, özünü dost kimi göstərmək. **Üzünə salmaq** – həyasızlıqla, sırtıqlıqla bir şeyi əldə etmək üçün çalışmaq. **Üzünə vurmaq** – 1) bir adamın eybini, qüsurunu, çatışmayan cəhətini kobudcasına özünə demək. [Teymur] *elə zənn eləyir ki, Molla onun çolaqlığını üzünə vurmaq istəyir.* "M.N.lətif." [Səkinə Rüstəmə:] *Bizim borcumuz səbirli olmaqdır, ay Rüstəm, hövsələsizlik eləyib hər şeyi üzlərinə vursan onlar da darılıb ipiörkəni qırarlar*. M.İbrahimov; 2) etdiyi yaxşılığı xatırladaraq utandırmaq, minnət qoymaq. **Üzünü açmaq** – 1) qeyri-münasib bir sözü deməklə və ya başqa bir hərəkəti ilə uşağın tərbiyəsinə, əxlaqına pis təsir göstərmək. [Zaman:] *Ay arvad, bu uşağı niyə çağırıb, üzünü açırsan?* Ə.Haqverdiyev; 2) keçmişdə: çarşabı üzündən kənar etmək, üzünü göstərmək. [Aktyor Sona xalaya:] *A qoca qarı, heç həya etmirsən ki, üzünü açıb bu naməhrəm kişilərə göstərirsən?* S.S.Axundov. [Cahan] *üzünü açıb göstərir*. Ü.Hacıbəyov; 3) *məc.* qızlığını almaq, bəkarətini, ismətini pozmaq. **Üzünü ağ etmək (eləmək)** – b a x **üzünü ağartmaq** 1-ci mənada. **Üzünü ağartmaq** – 1) b a x **üz ağartmaq**. *Qulluqçu ağanın üzünü ağardar*. (Ata. sözü.). [Halay Şiraslana:] *..Sənin şerin bizim divar qəzetinin üzünü ağardıbdır.* S.Rəhimov; 2) bir yazının ilk mətnini, qaralamasını təmiz köçürtmək, üzünü köçürmək. *Katib cavab verir ki, kağızın Mirzə Səfərdədir, üzünü ağardar, apararsan.* Ə.Haqverdiyev. **Üzünü bozartmaq** – 1) b a x **sifətini (üzünü) bozartmaq** ("**bozartmaq**"da). *Nəbi üzünü bozardıb dedi: – Sən bizdən nə istəyirsən?* "Qaçaq Nəbi"; 2) özünü göstərmək, öz xasiyyətini, xüsusiyyətini büruzə vermək (əsasən mənfi cəhətdən). *Artıq payız üzünü bozartmışdı.* B.Bayramov. **Üzünü çıxartmaq** – bir sənədin, yazının üzünü olduğu kimi köçürmək, surətini çıxarmaq. *Diplomun üzünü çıxartmaq*. – [Qoca:] [Vəsiyyətnamənin] *üzünü çıxarıb sizə gətirmişəm*. Mir Cəlal. **Üzünü görmə!** – pis adam haqqında işlədilir. *Üzünü heç görmə, üzü dönəndə; Elə bil, yer altdan əjdaha çıxır.* S.Vurğun. *Elə ki bu çalsaqqal kişi göy örtüklü stolun dalına keçdi, daha üzünü görmə!* Mir Cəlal. **Üzünü görək** *dan. zar.* – çoxdan görüşmədiyi yaxın adamla görüşərkən deyilir. **Üzünü görmək istəməmək** – zəhləsi getmək, nifrət etmək, görüşmək istəməmək. **Üzünü güldürmək** – şənləndirmək, sevindirmək, kefini açmaq. [Zeynal] *ağlamaqda olan üç anasız qızın üzünü güldürər, sınıq ürəklərini sevindirə bilərdi*. S.Hüseyn. **Üzünü qara etmək** – b a x **üzü qara etmək**. [Sədr:] *Salamat olun, ay uşaqlar, – dedi, – heç olmazsa siz bizim üzümüzü qara eləməyin*. M.Hüseyn. **Üzünü mürdəşir yusun!** *dan*. – qarğış məqamında işlədilir. [Nazlı:] *Görüm* [Ağalarovun] *üzünü mürdəşir mazutla yusun, bəlkə onda gözü bu nöyütdən doya!* Ə.Məmmədxanlı. **Üzünü turşutmaq** – üz əzələlərini yığmaq, üzünü qırışdırmaq, surətilə öz narazılığını, məmnunsuzluğunu ifadə etmək. [Calal başını kənara çəkib üzünü turşudur:] *Vallah, dadaş, genə çaxır içmisən.* C.Məmmədquluzadə. **Üzünü tutmaq** – 1) üzünü çevirib demək, müraciət etmək, üz tutmaq, üzünü döndərmək (çevirmək). [Şah] *üzünü hərəmlərə tutub xitab elədi.* M.F.Axundzadə. [Humay üzünü göy səmtinə tutaraq:] *Aman, ya rəbbi! Bu nə fəlakətli hal!..* H.Cavid; 2) b a x **üz tutmaq**. *Bilmirəm, haraya tutum üzümü? Az qaldı, itirəm bütün özümü.* H.K.Sanılı. **Üzünün əti (suyu) tökülmək** – biabır olmaq, rüsvay olmaq, hörmətdən düşmək, abrı getmək (tökülmək). **Üzünün qanı qaçmaq** – b a x **üzündən qan qaçmaq**. **Üzünün suyunu tökmək** – bərk danlamaq, biabır etmək, rüsvay etmək. **Alnı açıq, üzü ağ** – b a x **alnı açıq**. **Astarı üzündən**

**baha (baha başa gəlmək)** – b a x **astar**. **Hansı üzlə** – b a x **nə üzlə**. *Əliboş Cəmil indi xəstə nənəsinin yanına hansı üzlə dönəcək, ona necə cavab verəcəkdi.* S.Rəhimov. **Qapını üzünə çırpmaq** – b a x **qapı**. **Nə üzlə** – nə cəsarətlə, nə əsasla, nəyə arxalanaraq, nəyə güvənərək, nə haqla. [Səkinə:] *Mən pambıq işinə çıxmasam, sən* [Rüstəm] *yayın istisində nə üzlə qapı-qapı düşüb, özgə arvadlarına deyəcəksən ki, gəlin, pambıq batdı?* M.İbrahimov. [Bəy:] *Pristavın yanına bəs nə üzlə gedəcəksən?* Mir Cəlal. **Taleyi üzünə gülmək** – b a x **tale**.

**ÜZBƏÜZ** 1. *zərf* Üz-üzə, qabaq-qabağa, qarşı-qarşıya. *Üzbəüz oturmaq.* – [Cavad:] *Ana, mənim gözüm axunddan su içməyir, əvvəl deyirdi ki, qız ilə gərək üzbəüz danışam, biz də qızı gətirdik.* B.Talıblı. ☐ **Üzbəüz gəlmək** – rast gəlmək, təsadüf etmək, rastlaşmaq, qarşılaşmaq, üz-üzə gəlmək. *Üzbəüz gələn zaman ilk dəfə səhər-səhər; Mən sənə baxdım oğrun, sən mənə saldın nəzər.* M.Rahim.

2. *sif.* Qarşı, müqabil, ön. *Qarayazıda binədə olan kənd camaatı yaylağa qalxmazdan əvvəl Gəmi qaya ilə üzbəüz meşədə dayanardılar.* İ.Şıxlı.

**ÜZDƏ** *zərf* 1. Zahirən, zahirdə. *Əzizim, qəlbi nara; Tutuşdu qəlbi nara; Üzdə dost deyənlərin; Get, öyrən, qəlbin ara*. (Bayatı). *Səttarzadə üzdə Rübabəyə ürək verirdisə də, ürəkdən rahat deyildi*. Mir Cəlal.

2. Yer səthinə yaxın; dayaz. *Neft təbəqələri əvvəllər çox üzdə idi*. S.Vəliyev.

3. Açıqda, meydanda, göz önündə. [Vəzirbəyli:] *Yoldaş İslam Verdiyev, üzdə olmayan əsərlərlə də maraqlanmaq bizim vəzifəmizdir.* Mir Cəlal.

**ÜZDƏN** *zərf* 1. Az dərinlikdə, dayaz. *Üzdən belləmək.*

2. *məc*. Səthi, dərindən olmayaraq. *Əsərlə üzdən tanış olmaq.*

◊ **Üzdən görmək (getmək)** – mahiyyətinə varmamaq, çox dərinə getməmək, səthi baxmaq, ürəyinə salmamaq. [Vaqif:] *Ay Molla Vəli, – dedi, – bu, insanın özündən asılıdır, insan gərək üzdən getsin, çox dərinə əl aparmasın.* Çəmənzəminli. *Bu vaxta qədər Şirzad elə bilirdi ki, Yarməmməd üzüyola bir məzlumdur, hər şeyə inanır, hadisələri üzdən görür.* M.İbrahimov. **Üzdən iraq** – özündən sonra gələn (adətən deyilməsi münasib olmayan) sözün və ya ifadənin təsirini azaltmaq üçün ara söz kimi işlədilir. [Zeynal:] *..Bir kişinin, üzdən iraq, bir eşşəyi qalıbmış.* Ə.Əbülhəsən. **Üzdən olmaq** – biabır olmaq, abrı getmək. *Əzizim, üzdən oldum; Söhbətdən, sözdən oldum; Bir bivəfa yolunda; Ağladım, gözdən oldum*. (Bayatı).

**ÜZDÜRMƏ** "Üzdürmək"dən *f.is.*

**ÜZDÜRMƏK** *icb*. Üzməsinə səbəb və ya vasitə olmaq, üzməyə məcbur etmək. *Çayda Əmiraslan soyunub atı mindi və suyun dərinliyinə salıb bir neçə dəfə üzdürdü.* S.S.Axundov. *Üzdürüb atları, keçək buradan; Lazımdır qaçağa geniş bir meydan.* H.K.Sanılı.

**ÜZƏÇIXDI, ÜZƏÇIXMA** *is. etnoqr.* Təzəgəlinin öz ərinin qohumları ilə ilk görüşü.

**ÜZƏGÜLƏN** *sif.* İkiüzlü, riyakar; yaltaq. *Üzəgülən adam.* // İs. mənasında. *Üzəgülənin biridir.*

**ÜZƏN** 1. B a x **üzgüçü**.

2. *sif.* Suyun üzərində hərəkət edən; üzücü. *Üzən nasos stansiyası. Üzən elektrik stansiyası.*

**ÜZƏNGİ** *is.* Süvarinin ayağını dirəməsi üçün yəhərin iki tərəfindən asılı altı düz dəmir halqalardan hər biri. *Rüstəm kişi boz atın üzəngisinə ayaq qoyanda Maya dönüb ferma işçilərilə görüşdü.* M.İbrahimov. *Ağaxan bəy üzəngidə dikələrək: – ..Bunlar hamısı sizə qurbandır, – deyib, ətrafı paşaya göstərməyə başlayırdı.* S.Rəhimov.

**ÜZƏR** (adətən **üzərinə, üzərində, üzərindən** şəklində işlənir) b a x **üst**. *Kitabı stolun üzərinə qoymaq. Məsuliyyəti üzərinə götürmək. Qələmlər masanın üzərindədir. Məsuliyyət sizin üzərinizdə qalır. Düşmən üzərinə qoşun yeritmək.* – [Ərən:] *Piramidanın üzərindən düşüb əzilənlərin, ishaldan ölənlərin sayı yox idi*. Çəmənzəminli. *Hələ tamam qurumamış yağış gölləri; Üzərində bulud-bulud uçur milçəklər*. S.Vurğun.

**ÜZƏRLİK** *is.* 1. *bot.* Çılpaq gövdəsi, ensiz yarpaqları olan çoxillik kol bitkisi.

2. Həmin bitkinin quru gövdəsi, yarpaqları və ya toxumu (keçmişdə yandırılaraq tüstüsü və iyi xəstələrə verilirdi). *Üzərliksən,*

*havasan; Həzar dərdə davasan*. (Bayatı). *Qarı kərbəlayını .. azarlayanda üzərlik tüstüsünə verərdi, ildə neçə dəfə arxasına həcəmət qoyardı*. Çəmənzəminli. *Üzərliyin iyi uşağı vurduqca o, arabir səsini kəsir və yenə də davam edirdi.* Ə.Vəliyev.

**ÜZGƏC** *is.* Balıq və dəniz heyvanlarının hərəkət üzvü. *Delfinin bel üzgəci. – Başqa heyvanlarda olan qabaq və dal ayaqlara müvafiq olaraq balıqlarda döş və qarın üzgəcləri vardır*. Y.Əbdürrəhmanov.

**ÜZGÖRDÜ, ÜZGÖRƏNLİK** bax **tərəfgirlik**. ☐ **Üzgörənlik etmək** – tərəf saxlamaq. [Çingiz:] *Nəbi lələ, burada üzgörənlik etdin ha!* S.S.Axundov. [Xədicə:] *Orası doğrudur ki, Allah özü də üzgörənlik eləyir*. Ə.Vəliyev.

**ÜZGÖRƏ** *sif.* və *zərf dan*. Aşkar, bəlli, açıq, açıqdan-açığa, açıq-aşkar. *Üzgörə ədavət. Üzgörə düşmənçilik etmək.*

**ÜZGÖRÜMÇƏYİ** *is. etnoqr.* Təzəbəyin ilk dəfə təzəgəlinlə görüşərkən ona verdiyi hədiyyə. *Gəlin ayağını bəyin ayağının üstə qoyduqda bəy də başa düşərdi ki, gəlin ondan üzgörümçəyi istəyir.* H.Sarabski.

**ÜZGÖRÜŞÜ** bax **üzəçıxdı, üzəçıxma**.

**ÜZ-GÖZ** *is.* Sifət, üz. [Nəbi:] *Yazığın üzgözü, hər yeri qandır; Huşunu itirib, halı yamandır*. S.Rüstəm. [Səlim] *üz-gözünə, pərakəndə saçlarına çırpılan suyu, qarı tər kimi silib, barmaqları ilə tüklərini bir az yığışdırdı*. B.Bayramov. // Sir-sifət, zahiri sima, üzün ifadəsi. *Üz-gözündən düz adama oxşamır.*

◊ **Üz-göz olmaq** – münasibəti pozmaq, əlaqəsini kəsmək, düşmən olmaq. [Şərif:] *Yox, Almaz, mən sənin üstündə bütün kənd ilə üz-göz olmuşam.* C.Cabbarlı. **Üz-gözünü turşutmaq** – bax **üzünü turşutmaq** ("**üz**"də). *Səfər .. üz-gözünü turşudub, arvadı Nisəxanıma dedi.* S.Vəliyev. [Səməd] *üz-gözünü turşudub otağa göz gəzdirirdi*. İ.Hüseynov.

**ÜZGÜÇÜ** *is.* Suda üzməyi bacaran adam, üzən adam; üzən, üzücü. *Üzgüçü bir əlilə* [uşağı] *qucaqlayıb, o biri əlilə sahilə doğru üzməyə başladı.* M.Hüseyn. // Üzgüçülüklə məşğul olan idmançı. *Üzgüçülərin yarışı.*

**ÜZGÜÇÜLÜK** *is.* Suda üzmə, suyun üzərində və ya altında hərəkət etmə, üzmə. *Sualtı üzgüçülük.*

**ÜZGÜN** *sif.* Taqətsiz, yorğun, üzülmüş, əldən düşmüş, zəif, üzük. *Heç demirsən, qul Abbasın üzgündür; Qəm başından tutar, dərd ayağından.* Aşıq Abbas. [Zakir] *sonra üzgün bir halda cavab verdi*. H.Seyidbəyli.

**ÜZGÜNLƏŞMƏ** "Üzgünləşmək"dən *f.is.*

**ÜZGÜNLƏŞMƏK** *f.* Üzgün hala gəlmək, taqətdən düşmək, yorulmaq, üzülmək, əldən düşmək, zəifləmək.

**ÜZGÜNLÜK** *is.* Taqətsizlik, yorğunluq, zəiflik, əldən düşmə. *..Birdən Səməd bədənində zəiflik, üzgünlük hiss etdi.* İ.Hüseynov.

**ÜZLƏMƏ** "Üzləmək"dən *f.is.*

**ÜZLƏMƏK** *f.* 1. Üz çəkmək, üzünə bir şey yapışdırmaq, çəkmək. *Divarı ağ daşla üzləmək. Meydanı mərmərlə üzləmək.*

2. Torpağı üzdən şumlamaq, təpmək, yumşaltmaq.

3. Bir şeyin ən yaxşılarını, ən irilərini seçmək, ayırmaq.

**ÜZLƏNMƏ** "Üzlənmək"dən *f.is.*

**ÜZLƏNMƏK** *məch.* 1. Üz çəkilmək, üzünə bir şey yapışdırılmaq. *İnşaat məhlulu üzərindəki izlərə əsasən binanın kürsülük hissəsinin keçmişdə üç sıra ağ daşla üzləndiyi aydındır.* Ə.Salamzadə.

2. Üzdən şumlanmaq, təpilmək, yumşaldılmaq (torpaq).

3. Yaxşıları, iriləri seçilmək.

4. *məc.* Üz açmaq, sırtıqlaşmaq, həyasızlaşmaq, üz gətirmək.

**ÜZLƏŞDİRMƏ** "Üzləşdirmək"dən *f.is.*

**ÜZLƏŞDİRMƏK** *f.* İfadələri yoxlamaq və onların arasındakı ziddiyyətləri aradan qaldırmaq məqsədilə eyni iş üstündə cinayət məsuliyyətinə cəlb olunan adamları çarpaz sorğu-suala çəkmək, üz-üzə oturdaraq dindirmək. *Müttəhimləri üzləşdirmək.* – [Teymur:] *Biz* [oğruları] *üzləşdirə bilərik*. H.Seyidbəyli.

**ÜZLƏŞMƏ** "Üzləşmək"dən *f.is.*

**ÜZLƏŞMƏK** *f.* 1. Üz-üzə gəlmək, bir-birinə rast gəlmək, rastlaşmaq. *Cəfər küçə qapısında Hacağa ilə üzləşdi*. Ə.Vəliyev. // Məc. mənada. *Uşaq gərək çətinliklə üzləşəndə ondan qorxub qaçmasın*. S.Rəhimov. *Görüşlər, hicranlar; Belədir aləm; Daim qaranlıqla işıq üzləşir.* N.Xəzri.

2. Üzbəüz olmaq, üz-üzə gəlmək. *Dünənki hadisədən sonra İkram qalıb Ağazal ilə üzləşmək istəmirdi*. Ə.Əbülhəsən.

**ÜZLÜ** *sif.* 1. Üzü, qaymağı yığılmamış. *Üzlü süd*. – *Nənəm, a nazlı qoyun; Qırqovul gözlü qoyun; Pendiri kəsmə-kəsmə; Qatığı üzlü qoyun*. (Sayaçı sözü).

2. Üz çəkilmiş, üzü olan. *Üzlü döşək.*

3. *məc.* Nadinc, dəcəl, sırtıq, həyasız. [Pəri:] *Əbdül! Axır vaxtlarda sən çox üzlü* (z.) *olmusan*. C.Cabbarlı. *Salıb sındıranda xeyli qabqacaq; Deyərdin: – Uşağım üzlüdür, üzlü.* S.Rüstəm.

**ÜZLÜK** *is.* 1. Üz çəkmək üçün yarar parça və s. *Döşək üzlüyü*. // Sif. mənasında. *Üzlük çit. Üzlük məxmər*. // *sif.* Bir şeyin üzünə yapışdırmaq, çəkmək üçün yarar, üz çəkmək üçün olan. *Üzlük daş. Üzlük material.*

2. Üzə taxılan (bəzək və s.). *Əşrəfidən üzlük üzündə göyçək; Boğazı altında sığallı birçək*. M.P.Vaqif. // Qorumaq üçün üzə taxılan şey. *Dəbilqə üzlüyü*. // Niqab. // Maska. [Təlxək] *üzünə dəridən bir üzlük taxıb aşağıda oyun çıxarar və yamsılamaqla pul yığardı.* H.Sarabski.

3. Çörəyin üzünə sürtülən yağ və s.

**ÜZMƏ**[1] "Üzmək[1]"dən *f.is.*

**ÜZMƏ**[2] "Üzmək[2]"dən *f.is.*

**ÜZMƏ**[3] "Üzmək[3]"dən *f.is.*

**ÜZMƏK**[1] *f.* 1. Suyun üzündə və ya altında hərəkət etmək. *Bu zaman Qətibə hovuzun kənarında dayanmışdı, suda üzməkdə olan əlvan balıqlara baxırdı*. M.S.Ordubadi. *Sarışın bir rus gənci yeddi-səkkiz yaşlı oğluna üzmək öyrədirdi*. M.Hüseyn. // Suda batmadan hərəkət etməyi bacarmaq. *Mən üzə bilmirəm. O, suda çox yaxşı üzür.* // Xüsusi mexanizmlər vasitəsilə müəyyən istiqamətdə suyun üzündə, ya altında hərəkət etmək (gəmi, qayıq və s. haqqında). *Qayıqlar, gəmilər üzür yanaşı; Sallanan bayraqlar əks edir suda.* S.Vurğun. *Adamlar yerə atıldılar və sal yenə də xırıltılı mahnısını söyləyə-söyləyə sağ sahilə üzməyə başladı.* Ə.Sadıq. // Gəmidə, qayıqda və s.-də getmək. *Teploxodda Volqaboyu ilə üzmək*. // Suya batmadan axarı ilə getmək, hərəkət etmək (şeylər haqqında). *Xəzəl suyun üzəri ilə üzür.*

2. *məc*. Havada yavaş-yavaş, sərbəst surətdə hərəkət etmək; süzmək. *Planer havada üzür. Qartal havada üzür. Başımızın üstündən bir təyyarə üzüb keçdi. – ..Havada üzən yüngül şeylərin və havanın özünün də ağırlığı vardır.* H.Zərdabi. // *məc.* Ay, Günəş haqqında. *..Üstdəki Ay da göy dənizdə olan kimi axıb üzürdü*. S.Rəhimov. *Günəş çoxdan bozumtul buludlar arasında üzməkdə idi.* M.Hüseyn. // *məc*. Hərəkət edər kimi nəzərə gəlmək. *Göz işlədikcə uzanan düzlər yaşıllıq içində üzürdü.* M.Hüseyn. *Qəhrəmanlar kəndi işıq içində üzdüyü vaxt Gülyanaq yuxudan qalxıb, yataq otağının kəllə pəncərəsini açdı.* Ə.Vəliyev. // Obrazlı təşbehlərdə. *Xəyalımız üzəydi sevda dənizlərində; Ləpələr üzərində.* M.Müşfiq. *Üzürsən qoynunda xoş xəyalların; Boşluğa dirənən ehtimalların*. B.Vahabzadə.

**ÜZMƏK**[2] *f.* 1. Dərmək, qoparmaq, qırpmaq. *Sitarə .. durub, həyətə gedirdi və hər çiçəkdən birini dərib, hər güldən bir yarpaq üzüb, hərəsindən də bir həzz aparıb, bir lətafət anlayırdı*. Çəmənzəminli. [Cahan:] *Çəməndəki o güllərin; Ən gözəlin üzərəm*. Ü.Hacıbəyov.

2. Kəsib atmaq, kəsmək. *Mişar barmağını üzdü*. – [Mirpaşa:] *Yaxşı ki balta ayağını tamam üzməyib*. Z.Xəlil.

3. Ayırmaq, qoparmaq. [Dərviş:] *Ruqiyyə əlini əlimdən üzüb alaçığa qaçdı*. A.Divanbəyoğlu. *Mübaşir Məmməd* [Gülnazın] *üstünə şığıdı. Qızı qucaqlayıb ayaqlarını yerdən üzdü.* M.İbrahimov.

4. Haqq-hesabını qurtarmaq, ödəyib qurtarmaq, üzülüşmək. *Sonralar Məşədi Rəhimə bir dəfə bir qədər pul göndərdim. Qalan borcunu da bu yavıqda üzdüm*. C.Məmmədquluzadə.

**ÜZMƏK**[3] *f.* 1. Taqətdən salmaq, əldən salmaq, yormaq, üzüntü vermək. *Nə söyləyim, gəlməz dilə; Məni üzən fırtınalar.* H.Cavid. *Tamaşanın dərdi Minayəni üzürdü*. B.Bayramov.

2. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: qəlbini üzmək, canını üzmək, əlini üzmək və s.

**ÜZR** *is.* [*ər.*] 1. Edilən bir qəbahət və ya qüsurun qeyri-ixtiyari və ya məcburiyyət qarşısında edildiyini sübuta çalışaraq, bağışlanması

üçün irəli sürülən bəhanə, səbəb. *Üzrüm var. Üzrü ağlabatandır.* ☐ **Üzr istəmək (diləmək)** – öz qəbahət və ya hərəkətinin bağışlanmasını xahiş etmək. *Məşədibəy qapını açdı, müəllimdən üzr istəyib içəri girdi.* M.Hüseyn. [Halay Şiraslana:] *Şirin və həssas qəlbinə toxunduğumuz üçün üzr istəyirik!* S.Rəhimov.

2. Bəhanə, səbəb, dəlil. *Bir də görünsə bu sifət, bu əda; Üzr yoxumdur, mənə eylə cəza.* S.Ə.Şirvani. *İnkişaf çox zəifdir; Üzrümüz yoxdur əsla.* R.Rza. ☐ **Üzr gətirmək** – müqəssir olmadığını sübut etmək üçün səbəb göstərmək, dəlil gətirmək, sübut etmək. [Şah:] *Əgər üzr gətirməsə, boynunu vurdurun.* M.F.Axundzadə.

3. Qüsur, nöqsan, eyib.

4. B a x **üzr yeri**. ☐ **Üzr yeri** – ölü yeri, təziyə. *Üzr yerinə getmək.*

**ÜZRƏ** *qoş.* 1. Uyğun olaraq, əsasən, görə. *Camaat ata-baba adətləri üzrə duz-çörəklə ordunu pişvaz edib, şadlıqdan qurban kəsdilər.* Ə.Haqverdiyev. *Qız təkrar qızardı və qadının təklifi üzrə qalxıb çay tökdü.* Çəmənzəminli.

2. Bir işin qurtarmasının, sona çatmasının yaxınlaşdığını bildirir. *Qulam müəllim teleqramı yazıb qurtarmaq üzrə olan ağsaçlı kişinin tuşunda dayandı.* S.Rəhimov.

**ÜZRXAH** *is.* [*ər.* üzr və *fars.* ...xah] *klas.* Üzr istəyən, üzr diləyən, üzr gətirərək bağışlanmasını istəyən.

**ÜZRXAHLIQ** *is.* Üzr istəmə, üzr. [Ağa Rəhim:] *Nadürüst ağa Bəşir gör nə səbəb tapdı üzrxahlığa, ağa da güman edəcək ki, biz vaqiən saf və sadiq imişik.* M.F.Axundzadə. ☐ **Üzrxahlıq etmək** – üzr istəmək. [Manaf] *xanımı görəndə üzrxahlıq eləməyə çalışdı.* Ə.Vəliyev. *Əhmədov Reyhana üzrxahlıq elədi: – Reyhan xanım, onu mən gətirdim buraya, bağışlayın!* Mir Cəlal.

**ÜZRİSTƏYİCİ** *sif.* və *zərf* Üzr istəyən, üzr istəyər kimi, üzr istəyərək. *Cavan müqəssirmiş kimi yavaş üzristəyici bir əda ilə cavab verdi.* M.Rzaquluzadə.

**ÜZRLÜ** *sif.* və *zərf* Səbəbi qəbul oluna bilən, səbəbli, səbəbi olan (*üzrsüz* əksi). *Üzrlü səbəb. Üzrlü dərs buraxmaq. Üzrlü işə çıxmamaq.*

**ÜZRSÜZ** *sif.* və *zərf* Üzrlü səbəbi olmayan, səbəbsiz (*üzrlü* əksi). *Üzrsüz dərsə gəlməmək. Üzrsüz səbəblərə görə...*

**ÜZSÜZ** *sif.* 1. Üzü, qaymağı yığılmış. *Üzsüz süd. Üzsüz qatıq.*

2. Üz çəkilməmiş, üzü olmayan. *Üzsüz döşək.* – [Gülbadam] *üzsüz boz balışı, üzü qırmızı çiçəkli çitdən mütəkkəni döşəyin ortasına qoydu.* N.Nərimanov.

3. *məc.* Utanmaz, həyasız, sırtıq.

**ÜZÜAÇIQ** *zərf* və *sif.* Üzünü çadra ilə örtməmiş; çadrasız. [Şərəfnisə xanım:] *Müsyö Jordan beyninə salıbdır ki, Parijdə qızlar, gəlinlər məclisdə, yığıncaqda üzüaçıq oturubdururlar.* M.F.Axundzadə. *Və yenə mat qalmalı işdir ki, nə səbəbə bir para müsəlman qardaşlar razı olurlar ki, övrətləri yad kişilərlə üzüaçıq danışırlar.* C.Məmmədquluzadə.

**ÜZÜAĞ** *sif.* Utanılacaq işi olmayan, vicdanı təmiz, alnıaçıq, namuslu, vüqarlı (*üzüqara* əksi). *Təbəssümlə oyansın beşikdəki körpələr; Bizim xoşbəxt, üzüağ anaların səsinə.* S.Rüstəm.

**ÜZÜAĞLIQ** *is.* Üzüağ olma, alnıaçıqlıq, namusluluq; vüqar.

**ÜZÜAŞAĞI** *sif.* və *zərf* 1. Getdikcə aşağı tərəfə meyil edən, yuxarıdan-aşağı; başıaşağı. *Üzüaşağı cığır. Üzüaşağı getmək.* – *Şəlalələr qayalardan üzüaşağı gurlayıb axır, köpüklənir.* M.İbrahimov. *Qumru bunu eşidər-eşitməz yerindən qopub üzüaşağı dərəyə doğru yüyürdü.* Ə.Məmmədxanlı.

2. Çayda suyun axıb getdiyi tərəf; başıaşağı. *Çayda üzüaşağı üzmək.*

**ÜZÜBOZ** *sif.* Utanmaz, nəzakətsiz, ədəbsiz, kobud. *Üzüboz adam.*

**ÜZÜBOZLUQ** *is.* Utanmazlıq, nəzakətsizlik, ədəbsizlik, kobudluq.

**ÜZÜCÜ**[1] *sif.* 1. B a x **üzgüçü**. *Hərçənd Yasəmən çox üzücü idi, amma bu itiaxan, daşları və böyük kolları yumalayan seldə üzmək mümkün deyildi.* S.S.Axundov. *Tərlan da, həkim də nəfəs almadan uşaqla üzücünün batdığı yerə baxdılar.* M.Hüseyn.

2. Üzən, suyun üzərində duran, hərəkət edən. *Üzücü nasos. Üzücü kran. Üzücü mayak.*

**ÜZÜCÜ²** *sif.* Adamı üzən, taqətdən, əldən salan; yorucu. *Üzücü qızdırma. Üzücü intizar. – Üzücü gözətləmə dəqiqələrində Nəriman nə təmiz bahar havasından, nə mənzərələrdən, nə də Ənvərin ara-sıra zarafatlarından xoşlanırdı.* Mir Cəlal.

**ÜZÜDÖNÜK** *sif.* və *zərf* Öz yaxınlarından üzünü döndərmiş, onlarla əlaqəsini kəsmiş, onları atıb getmiş, onlara arxa çevirmiş, xain çıxmış. *Üzüdönük övlad.* – [Kərbəlayı Allahverdi:] *A kişi, bu camaat necə üzüdönük olarmış?!* Ə.Haqverdiyev.

**ÜZÜDÖNÜKLÜK** *is.* Üzüdönük adamın hərəkəti; üzü dönmə, arxa çevirmə; xəyanət.

**ÜZÜGÜLƏR** bax **gülərüzlü**. *Bakılılar bütün Azərbaycan xalqı kimi səxavətli, qonaqpərvər, üzügülər .. adamlardır.* H.Sarabski. *Ey ürəyi sevinc dolu; Üzügülər məktəbli qız!* M.Dilbazi.

**ÜZÜGÜLƏRLİK** bax **gülərüzlülük**.

**ÜZÜGÜLMƏZ** *sif.* Heç vaxt üzü gülməyən, qaşqabaqlı, hirsli, acıqlı, mızı. *Üzügülməz adam.* // *məc.* Kədərli, qəmli.

**ÜZÜK¹** *is.* 1. Əsasən qızıldan qayrılan, bəzək üçün və ya evlilik rəmzi kimi barmağa taxılan halqa; barmaqlıq. *Brilyant qaşlı üzük. – Balaca bir qutudan* [Səkinə] *"Zvezda" markalı qızıl saat və zümrüd qaşlı bir üzük çıxartdı.* M.İbrahimov. *Güldanə titrəyən barmaqlarından anasının bağışladığı üzükləri çıxardıb gizlətdi.* Ə.Vəliyev. ☐ **Üzük gətirmək (aparmaq)** *etnoqr.* – razılıq əldə edildikdən sonra qıza nişan taxmaq üçün oğlan evindən qız evinə üzük və şirni gətirmək (aparmaq). [Rəşid:] *Bir neçə gündən sonra üzük aparırlar, Fərəcin böyük qızı Qurbanqulu üçün alınır.* T.Ş.Simurq. *İki gün sonra elçiliyə gələn arvadlar üzük gətirdilər.* M.S.Ordubadi. **Üzük qaşı** – üzüyün üstündə olan qiymətli daş. *Qanlı göz yaşlarıyla ömrü ötüb gecənin; Gözündə bir quruşa dəyərmi üzük qaşı?* B.Vahabzadə. **Üzük taxmaq** – nişanlı olduğunu bildirmək üçün qızın barmağına üzük keçirmək; nişanlamaq. *Qıza üzük taxmaq. – Qətibənin barmağına Şərqin ən qiymətli cavahirini daşıyan bir üzük taxıldı, kəbin siğəsi oxundu, sonra da şam süfrəsinin başına keçdilər.* M.S.Ordubadi.

2. Üzük şəklində detal, hissə. *Valın üzüyünü dəyişmək.*

◊ **Üzük qaşı kimi əhatə etmək (dövrəyə, araya almaq, halaylamaq)** – əhatə etmək, mühasirəyə salmaq, ətrafını tutmaq, hər tərəfini sarmaq. *Məmmədəli bəy at minib, öz dəstəsilə Nəbini üzük qaşı kimi araya alır.* "Qaçaq Nəbi". *Maşın məktəb həyatində dayananda camaat onu üzük qaşı kimi halaylamışdı.* R.Rza. **Üzükdən keçmək** – çox zərif, incə şey haqqında. *Gözəl xala deyir, Qəmər dəvə yunundan bir pencəklik şal toxumuşdu, üzükdən keçirdi.* Ə.Vəliyev.

**ÜZÜK²** bax **üzgün**. [Kərəm:] *Dərdü qəm çəkirəm, üzüyəm, üzük; Qıyma mənə, ay ciyərim parəsi!* "Əsli və Kərəm".

**ÜZÜKGİZLƏTDİ, ÜZÜK-ÜZÜK** *is.* Üzüklə oynanılan bir oyun adı. *Bir yanda toya gələnlər üzük-üzük oynarlar.* R.Əfəndiyev.

**ÜZÜKVARİ** *sif.* Üzük şəklində olan; halqavari. *Üzükvari detal.*

**ÜZÜQARA** *sif.* və *zərf* Utanılacaq, əskik işi olan; xəcalətli (*üzüağ* əksi). *Dünyadan köçərdim mən üzüqara; Xalqa dəyməsəydi köməyim mənim.* S.Rüstəm. *Yarın özü qaradır; Qaşı-gözü qaradır; Yoxsul qonaq istəməz; Çünki üzüqaradır.* (Bayatı).

**ÜZÜQARALIQ** *is.* 1. Üzüqara olma, utanılacaq, əskik işi olma; utanılacaq vəziyyət, iş; rüsvayçılıq, biabırçılıq. ☐ **Üzüqaralıq etmək** – utanılacaq, pis iş görmək. *Nə üzüqaralıq etdim, mənə bu cəfa neçindir?* S.Ə.Şirvani.

2. *məc.* Pislik, yamanlıq. *Qış çıxar, üzüqaralıq kömürə qalar.* (Ata. sözü).

**ÜZÜQIRXIQ** *sif.* 1. Üzünü qırxmış, ya qırxdırmış, üzündə tük olmayan. *Üzüqırxıq kişi.*

2. Keçmişdə: cəhalətpərəstlərin üzünü qırxan ziyalılara verdikləri təhqirli ad. *Beş nəfər üzüqırxıq, laməzhəb, dinsiz kazak hər nə bilir, eləyir.* P.Makulu.

**ÜZÜQOYLU** *zərf* Üzü aşağı olduğu halda. *Üzüqoylu uzanmaq. Nimçəni üzüqoylu qoymaq. – Əli üzüqoylu arxa yıxıldı və atəşə başladı.* H.Nəzərli. [Qərənfil xala] *dəmkeşi üzüqoylu qazanın ağzına çevirdi.* Ə.Vəliyev.

**ÜZÜLMƏ** "Üzülmək"dən *f.is.*

**ÜZÜLMƏK** *f.* 1. Xəstəlik, yorğunluq və s. nəticəsində gücdən düşmək, əldən düşmək,

taqətdən düşmək, zəifləmək. *Azarladım, ölmədim; üzüldüm, öldüm*. (Ata. sözü). [Zeynəb Səliməyə:] *Yorğunsan, üzülmüsən, get bir az dincəl!* Ə.Məmmədxanlı.

2. Çox köhnəlmək, yıpranmaq, əldən düşmək. *Köynək lap üzülmüşdür*. // Cırılmaq, süzülmək, qırılmaq. [Yusif] *köynəyin üstündən toqqanı çox bərk çəkdiyi üçün ortası az qala üzülürdü*. B.Bayramov.

3. Qopmaq, ayrılmaq, aralanmaq. [Həcərin] *sağ əli aynalıdan üzülməmişdi.* S.Rəhimov. *Onun əlləri; Gecə yarısınadək; Sükandan üzülməmiş.* İ.Səfərli.

4. Qurtarmaq üzrə olmaq, qurtarmaq. *Anbarlardan ərzaq ehtiyatı üzülmür, tələbələrə gündə üç dəfə yemək verilirdi*. S.Rəhimov.

5. Bir sıra sözlərə qoşularaq mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: canı üzülmək, qəlbi üzülmək, əli üzülmək.

**ÜZÜLÜŞMƏ** "Üzülüşmək"dən *f.is.*

**ÜZÜLÜŞMƏK** *f.* 1. Borcunu verib, haqq-hesab edib qurtarmaq.

2. Ayrılmaq, aralanmaq, uzaqlaşmaq, əlaqəni kəsmək. [Vaqif xana:] *İrəvan xanı Ərzurum və Qars paşalarına müraciət edib, İraklidən üzülüşmək istəyir.* Çəmənzəminli.

**ÜZÜM** *is.* Ağ, qara və ala rəngli dənələri olan salxımlı meyvə. *Üzüm mürəbbəsi. Üzüm şirəsi. – Hər kəs ya qabağına üzüm, kişmiş yığaraq, ya da əlində bir şey tutaraq satır.* M.İbrahimov. *Əzizim üzüm qara; Bağımda üzüm qara; Yar yanına gedirəm; Əlim boş, üzüm qara.* (Bayatı).

**ÜZÜMÇÜ** *is.* Üzümçülüklə məşğul olan adam. *Azərbaycan üzümçüləri.*

**ÜZÜMÇÜLÜK** *is.* 1. Üzüm tənəkləri əkmək və üzüm yetişdirməklə məşğul olma. *Üzümçülük təsərrüfatın gəlirli sahələrindən biridir.*

2. Kənd təsərrüfatı elminin üzüm tənəkləri əkməyi və becərməyi öyrənən sahəsi.

**ÜZÜMLÜK** *is.* Üzüm bağı, meynəlik, tənəklik. *Birdən üzümlüklərin kənarında göyə ucalan çinar ağacını və ilan kimi onun başına dolanan tənəyi gördü*. İ.Şıxlı.

**ÜZÜNDƏN** *qoş*. Səbəb, nəticə bildirir. [Fikrət:] *Avariyalar çox vaxt* [gənclərin] *diqqətsizliyinin və təcrübəsizliyinin üzündən olur.* M.Hüseyn. *Gülara ailəsinin yoxsulluğu üzündən kəndin bəylərindən Xosrov bəy Poladovun evində qulluqçuluq edirdi.* Ə.Vəliyev.

**ÜZÜNTÜ** *is.* 1. Adamı üzən qəm, kədər, dərd, iztirab, ruhi əzab. *Kim deyir ki, ana, vaxtını keçir; Dörd divar içində üzüntülərlə.* M.Rahim.

2. Üzgünlük, zəiflik, yorğunluq, taqətsizlik. [Əliqulunun] *üzünə qayğı və kədər qonmuşdu. Gözlərində yorğunluq və üzüntü var idi.* Q.İlkin.

**ÜZÜNTÜLÜ** *sif.* Adamı üzən, əldən salan; üzücü, əzici, əzablı. *Lalə Qüdrətin gəlişini gözləyir, ..amma yenə üzüntülü düşüncələrdən sonra narahat bir yuxuya gedirdi*. M.Hüseyn. // Həzin, qəmli, kədərli. *Zınqırovların səsi yavaş-yavaş musiqiyə çevrilir, nər dəvə üstündə bardaş qurub oturmuş sarban həsrət dolu üzüntülü bir mahnı oxuyur*. Ə.Məmmədxanlı.

**ÜZÜNÜK** bax **üzgün**. *Getdikcə üzünük düşən mal-qara yazağzı doyunca yeməsə, bir neçə günün içində batardı*. B.Bayramov.

**ÜZÜÖRTÜLÜ** *sif.* Üzü örtülmüş halda olan, üzüaçıq olmayan. *Arvadların biri, yəni Mustafanın anası üzüörtülü* (z.) *sevincək qaçır oğlunun yanına*. C.Məmmədquluzadə.

**ÜZÜSTƏ** *zərf* Üzü aşağı olduğu halda, üzüqoylu. *Üzüstə yıxılmaq. Üzüstə yerə dəymək. – Bayatı çəkən oğlan üzüstə uzanıb, nə isə deyirdi.* Mir Cəlal.

**ÜZÜSULU** *zərf dan*. Biabır olmadan, öz abrını saxlayaraq. [Ələsgər:] *Gecə-gündüz Allaha şükür elə ki, üzüsulu bu bihəyanın üzündən qurtardın*. Ə.Haqverdiyev. *Əlisa dinməz-söyləməz, üzüsulu çıxıb getdi*. S.Rəhimov.

**ÜZÜŞMƏ** "Üzüşmək"dən *f.is.*

**ÜZÜŞMƏK** *qarş*. Üzmək (çoxları haqqında). *Qurbani der: – Bahar olur, gəlir yaz; Göllərdə üzüşür ördək ilə qaz.* Qurbani. *Bir də görürdün... üzümçülər balıq kimi dənizə tökülüb üzüşür, suyun dibinə enib-qalxırlar*. Mir Cəlal.

**ÜZÜYOLA** *sif.* Sözəbaxan, məsləhətə qulaq asan, söz eşidən, inad olmayan. *Üzüyola adam. – Əsmər təbiəti yumşaq, üzüyola bir qızdır.* S.Hüseyn. *Dursun arvad oğlunun üzüyola* (z.) *olduğuna şübhə etmədiyi üçün bu tədbirləri hələlik kafi görürdü*. Ə.Əbülhəsən.

**ÜZÜYOLALIQ** *is.* Üzüyola adamın xasiyyəti; sözə, məsləhətə qulaq asma, sözə baxma. *Üzüyolalıq yaxşı xasiyyətdir. – Səfər kişinin üzüyolalığı hamıya məlumdur.* Mir Cəlal.

**ÜZÜYUXARI** *zərf* Aşağıdan yuxarıya doğru; başıyuxarı. *Üzüyuxarı çıxmaq. – Maşın küçələri axşamüstü gəzintisinə çıxmış adamlarla dolu olan Şimranı üzüyuxarı qalxırdı.* M.İbrahimov. *Yusif üzüyuxarı çinara baxdı.* B.Bayramov.

**ÜZÜYUMŞAQ** *sif.* Xahişdən keçə bilməyən; xasiyyəti yumşaq. *Üzüyumşaq kişi.*

**ÜZÜYUMŞAQLIQ** *sif. dan*. Üzüyumşaq adamın xasiyyəti.

**ÜZ-ÜZƏ** b a x **üzbəüz**. *Oturub üz-üzə üç nəfər çoban; Yanıq Əjdər, Qara Qurban, gənc Osman.* H.K.Sanılı. *Vaxt olur, üz-üzə də; Əyləşir iki düşmən.* H.Hüseynzadə. ☐ **Üz-üzə gəlmək** – 1) b a x **üzbəüz gəlmək**. *..Mirzağa Cəmilə ilə yenə üz-üzə gəldi.* S.Hüseyn. *Səməd əmisi ilə üz-üzə gələndə həmişə ürəyində bir sıxıntı, qorxu və narahatlıq hiss edərdi.* İ.Hüseynov; 2) *məc*. toqquşmaq, çarpışmaq. *Azğın küləklərlə gəlib üz-üzə; Gah batdım dənizə, gah çıxdım üzə.* Ə.Cavad. *Təbiətlə nə qədər; İnsan üz-üzə gəldi*. B.Vahabzadə.

**ÜZV** *is.* [*ər.*] 1. İnsan bədəninin bir hissəsi; orqan, əza. *Bədən üzvləri. – Orqanizm üzvlərdən ibarətdir. Bu üzvlərin hər biri müəyyən vəzifə ifa edir.* "İnsanın anatomiya və fiziologiyası". *İnsanın heç bir üzvündən o qədər zərər insana yetişməz, nə qədər ki dilindən yetişər.* C.Məmmədquluzadə.

2. Hər hansı bir təşkilatın, birliyin, cəmiyyətin və s.-nin tərkibinə daxil olan adam. *Partiya üzvü. Yerli komitənin üzvü*. – [Nüsrət:] *Yoldaş İmamyar da kolxozun ən çalışqan üzvlərindən biridir*. C.Cabbarlı. *Laçın ailə üzvləri ilə görüşdü*. M.Hüseyn.

**ÜZVİ** *sif.* [*ər.*] 1. Həyat prosesləri ilə səciyyələnən; canlı, orqanik. *Üzvi aləm. Üzvi təbiət.*

2. Heyvan və bitki orqanizmlərinin pozulması, çürüməsi nəticəsində əmələ gələn; belə çürümənin məhsulu olan. *Üzvi gübrələr.* ☐ **Üzvi kimya** – kimyanın, karbonun başqa elementlərlə birləşməsini tədqiq edən şöbəsi.

3. *məc.* Bir şeyin əsil mahiyyətinə, əsasına aid olan, bir şeylə ayrılmaz surətdə bağlı olan; daxili. *Üzvi bağlılıq. Nəzəriyyə ilə praktikanın üzvi birliyi.*

4. Tamı, bütövü əmələ gətirən hissələrdən hər biri. *Cümlənin baş üzvləri.*

**ÜZVLÜK** *is.* Hər hansı bir qrupun, təşkilatın, birliyin, cəmiyyətin və s.-nin üzvü olma. *Üzvlük bileti*. – [Qulu Həsənə:] *Harada narazı varsa, başımıza toplayaq. Hər kəsi görsən tapşır, üzvlük haqqı verməyin, bildinmi?* Çəmənzəminli.

# Vv

**V** Azərbaycan əlifbasının otuzuncu hərfi. B a x **ve**.

**VA** b a x **vah**.

**VABAL** b a x **vəbal**.

**VABƏSTƏ** *sif.* [*fars.*] *klas.* Bağlı, əlaqədar, asılı. *Bu gündən etibarən mənim həyatım sənə vabəstədir.* A.Şaiq. *Ruhum! Səadətim sənə vabəstə hər zaman! Sənsiz cahanda mən yaşamaq istəməm, inan!* H.Cavid.

**VABƏSTƏLİK** *is.* Bağlılıq, əlaqədarlıq, asılılıq. *Vabəstəlikdən bəlkə qurtulaq; Açıla qoldan bu tənabımız.* Şəhriyar.

**VACİB** *sif.* [*ər.*] Yerinə yetirilməsi mütləq lazım olan, labüd olan, zəruri, ən mühüm. *Vacib məsələ. Bu gün çox vacib işim var.* – [Şəhrəbanı xanım:] *Gülçöhrə, get, atan damın dalısında çobanlarla danışır, de ki, bir bura gəlsin, vacib işim var.* M.F.Axundzadə. [Əbülhəsən bəy:] *Hərgah vacib işim olmasaydı, heç vaxt mən verdiyim vədəmə xilaf çıxmazdım.* Ordubadi. ☐ **Vacib bilmək** – özünə borc bilmək, lazım bilmək, zəruri hesab etmək. *Kosa .. həlalik səbirli olmağı vacib bildi.* S.Rəhimov. **Vacib olmaq** – yerinə yetirilməsi mütləq lazım olmaq, zəruri olmaq. *Vacib oldu eyləmək ol biədəbdən ictinab.* S.Ə.Şirvani.

◊ **Vacib forma** *qram.* – felin, iş və ya hərəkətin icra edilməsinin vacib olduğunu bildirən şəkli; məs.: oxumalıyam, qayıtmalı idim və s.

**VACİBAT** *is.* [*ər.* "vacib" söz. cəmi] *köhn.* Din və köhnə adab baxımından yerinə yetirilməsi və ya riayət edilməsi vacib olan işlər. // Ümumiyyətlə, çox vacib olan şey. *İnsan üçün gəzmək vacibatdandır.* H.Zərdabi.

**VACİBLİ** b a x **vacib**. [Salman bəy:] *Bu gecə saat birəcən yazmışam, genə qurtara bilməmişəm. Hamısı vacibli kağızlardı.* N.Vəzirov.

**VACİBLİK** *is.* Yerinə yetirilməsi vacib, məcburi olma; lazımlıq, labüdlük. [Xəlil Rzanın] "*Hara qaçırsan, dayan!*" *əsəri qaldırdığı problemin vacibliyi, əhatə dairəsinin genişliyi və kəskin ideya-məzmunu baxımından lirik poema təsiri bağışlayır.* B.Nəbiyev.

**VADAR** [*fars.*] Məcbur, məcburiyyət qarşısında qalan. *Mən belə etməyə vadaram.* ☐ **Vadar etmək** – məcbur etmək. *Bu xətti-hərəkəti tutub getməyə möhtərəm yazıçılarımızı o vaxt vadar edən bilmirdim, nə idi.* C.Məmmədquluzadə. *Bir də görürdün* [dəli Səməd] *döyüldüyü yerdə gözləri yaşlı qəhqəhə çəkib gülürdü, məzəli-məzəli qissələr nağıl eləyib, eşidənləri də gülməyə vadar edirdi.* Çəmənzəminli. **Vadar olmaq** – məcbur olmaq. *Əlini silaha atmağa vadar oldu.*

**VADİ** *is.* [*ər.*] 1. İki dağ arasında böyük, uzun çuxur, düzən. *Buranın* [Dağıstanın] *o biri dağlıq qismi bəzi məhsuldar vadi və yaylaqlara malik olsa da, ümumiyyətlə, yaşamaq üçün çox çətin və məşəqqətlidir.* A.Bakıxanov.

2. Çay yatağı, çayın axdığı yer. *Göyün üzünə ulduzların səpələnməsinə baxmayaraq, çayın vadisi qaranlıq idi.* İ.Şıxlı.

3. *məc.* Sahə, meydan, zəmin. *Mətbuat vadisinə təzə qədəm qoyan* "*Molla Nəsrəddin*" *Axund Əbuturabın bu məqaləsini buraxıb keçə bilməzdi.* C.Məmmədquluzadə. [Firidun] *müharibə cəbhəsi adlanan bu ölüm vadisində özünün də bir gün məhv ola biləcəyi fikrini indidən ata-anasına bildirmək istəyir.* M.Hüseyn.

4. *məc.* Klassik ədəbiyyatda səhra, çöl mənasında olaraq adətən tərkiblərdə işlənmişdir. *Vadiyi-qürbətdə can verdim, məni ol şahi-hüsn; Bir gecə xani-vüsali üzrə mehman etmədi.* Füzuli. *Salmış məni vadiyi-kəmanə; Bin qəmlərə eyləmiş nişanə.* Məsihi. *Qalmışam vadiyi-qəm içrə, kimim var, Zakir! Didələr oldu həmin munisi-qəmxar mənə.* Q.Zakir.

**VÁFLİ** [*alm.*] Üzərində dama-dama naxışlar olan yüngül peçenye növü (bəzən içinə dondurma və s. tökmək üçün qovuq şəklində olur).

**VAGİNÍZM** *is.* [*lat.*] Qadınlarda xarici cinsiyyət orqanlarının yüksək həssaslığı.

**VAGİR** *is.* [*fars.*] *köhn.* Bir, yaxud bir neçə şəxs tərəfindən növhə, mərsiyə, yaxud nəğmə oxunarkən son beyti və ya beytləri təkrar edən adam.

**VAGİRƏ** *is.* [*fars.*] *köhn.* Bir neçə şəxs tərəfindən təkrar olunan son beyt və ya beytlər.

**VAGİRLİK** *is. köhn.* Vagirin işi. □ **Vagirlik etmək** – başqası tərəfindən oxunan növhənin, mərsiyənin, yaxud nəğmənin son beytini təkrar etmək. *..Kişi məclisində iki nəfər bir-birilə meyxana yarışına çıxmışdı. Meyxana deyənlərə vagirlik eləyən bir dəstə oğlanın qıyya vuran səsləri göyə ucalmışdı.* Ə.Məmmədxanlı.

**VAGÜZAR** [*fars.*]: **vagüzar etmək** *köhn.* – həvalə etmək, tapşırmaq; birinin üzərinə, öhdəsinə qoymaq. [Şah:] *İndi .. mən məcburam ki, səltənətdən əl çəkib, taxt-tacı bir kimsəyə vagüzar edim*. M.F.Axundzadə. *Hacı Səlim öz sağlığında cəmi pul və əmlakını öz arvadı Sənəm xanıma vagüzar edibdir.* Ə.Haqverdiyev.

**VAĞ** *is.* 1. *zool*. Əsasən balıqla qidalanan uzundimdik quş. *Boz vağ su yaxınlığında yaşayır və orada da qidalanır; onun ayaqları uzun olur, nəinki pəncə lüləsində, hətta baldırının çox hissəsində tük olmur.* "Zoologiya".

2. *məc*. *dan*. Maymaq, ağzıaçıq, huşsuz adam haqqında. *Ağzını ayırıb vağ kimi dayanıb*.

**VAĞAM** *sif. məh*. 1. Həddindən artıq yetişmiş, vaxtı ötmüş, vaxtında biçilməmiş və ya dərilməmiş. *Qızılgüllər vağam olub töküləndə budağında; Ölməz şair, sən can verdin böyük günlər sorağında*. N.Rəfibəyli.

2. Rütubətdən pozulmuş, tökülmək dərəcəsinə gəlmiş.

**VAĞAMLAMAQ** *f.* 1. B a x **vağanımaq**.

2. Rütubətdən pozulmaq, tökülmək.

**VAĞANIMAQ** *f.* Ötmək, vaxtında biçilməyib və ya dərilməyib qalmaq. *Mirzə bir gün baxdı ki, onun tarlası tamamən yetişib vağanıyıbdır.* S.Rəhimov.

**VAĞANIMIŞ** *f.sif.* Həddindən artıq yetişmiş, vaxtı ötmüş, vaxtında biçilməmiş və ya dərilməmiş. *Vağanımış taxıla od düşsə, bütün məhsul məhv olduğu kimi, pambığa sovka daraşsa, insanın zəhməti əlində qalar*. Ə.Vəliyev.

**VAĞZÁL** [*ing.*] Sərnişinlərə xidmət etmək üçün dəmiryol stansiyasında xüsusi bina. *Maşın gedəndən sonra vağzal birdən seyrəldi.* C.Məmmədquluzadə. *Sanitar maşını bizi vağzala qoyub qayıtdı.* Mir Cəlal. □ **Çay, dəniz vağzalı** – paroxodların durduğu yerlərdə sərnişinlər üçün bina.

**VAĞZALI** *is. mus*. Azərbaycan xalq oyun havalarından birinin adı.

**VAH** b a x **vay** 1-ci mənada.

**VAHƏ** *is.* [*ər.*] Böyük səhra və ya çöl ortasında suyu və yaşıllığı olan sahə. *Bu münbit vahə qanqal və tikan bitirməz.* M.İbrahimov. *Kanallar çəkilərək, səhradan minlər və on minlərlə hektar torpaq geri alınmış, yüzlərlə quyular qazılaraq, vahələr yaranmışdır.* Ə.Sadıq.

**VAHƏSRƏTA** *nida* [*ər.*] *klas.* Həsrət, təəssüf bildirir. *Vahəsrəta ki, bir sənəmi-bivəfa üçün; Rüsva olub cahanara əfsanəyəm yenə.* Kişvəri. *Çox həsrətəm dübarə görüm bir camalını; Vahəsrəta, könüldə qala gər bu həsrətim!* S.Ə.Şirvani.

**VAHİD** [*ər.*] 1. *sif.* Ancaq bir, tək, yeganə. *Onun vahid bir oğlu var. – Kim döşünə döyər ki; Mən vahidəm, mən birəm!* B.Vahabzadə.

2. *sif.* Ümumi, bir, birləşmiş. *Vahid cəbhə.*

3. *is.* Eynicinsli kəmiyyətləri ölçmək üçün qəbul edilmiş kəmiyyət, ölçü. *Pul vahidi. Ölçü vahidi.*

4. *is.* Bir tam təşkil edən şeyin müəyyən müstəqilliyə malik olan xüsusi hissəsi. *Donanmanın döyüş vahidləri. Təsərrüfat vahidi.*

**VAHİDLİK** *is.* 1. Təklik. *Ürfan nəğməsi deyir Allah vahidliyindən; O böyük Xacə Hafiz süsləndirir ürfanı.* Şəhriyar.

2. Birlik, vəhdət, bütövlük, bölünməzlik; vahid şeyin halı.

**VAHİMƏ** *is.* [*ər.*] Xəyala gələn qorxulu şeylər, hövl. *Təklik, xarabanın vahiməsi, qaranlıq gecə .. bunların heç birisi ərindən qaçmış cavan gəlinə əsər edə bilmədi.* Çəmənzəminli. // Qorxu, dəhşət; təşviş və narahatlıq. *Hamının gözündə küt və vahimə ilə dolu bir ifadə hakim idi.* M.İbrahimov. *Qız vahimə və iztirabla yoldaşlarına baxır və heç bir söz demirdi.* İ.Əfəndiyev. □ **Vahimə basmaq (götürmək, bürümək**) – bərk qorxmaq, dəhşətə düşmək, qorxuya düşmək, vahimələnmək. *Nurəddin qorxaq uşaq deyilsə də, meşənin*

*vahiməsi onu da basmışdı*. S.S.Axundov. *Tellini yenidən vahimə bürüdü. O qorxurdu*. S.Hüseyn. **Vahimə etmək** – qorxmaq. [Ağa Kərim:] *Gərək o hər necə desə, onun sözündən çıxmayasan və heç vahimə və ehtiyat etməyəsən*. M.F.Axundzadə. *Heç vahimə etmirəm əcəldən; Mən qorxmamışam, ana, cədəldən*. A.Səhhət. **Vahiməyə düşmək** – bax **vahimələnmək**. *Dolama yollarla enirkən bəzi yoldaşlarımız vahiməyə düşdü*. S.Rüstəm. *Xanlar anasının daha da narahat olduğunu, doğrudan da vahiməyə düşdüyünü görüb, onu toxdatmağa çalışdı*. S.Rəhimov. **Vahiməyə salmaq** – bax **vahimələndirmək**. *Həyətə girdikdə əsrarəngiz .. sükut insanı vahiməyə salırdı*. M.İbrahimov.

**VAHİMƏLƏNDİRİLMƏ** "Vahimələndirilmək"dən *f.is.*

**VAHİMƏLƏNDİRİLMƏK** *məch*. Vahiməyə salınmaq, təşvişə salınmaq, qorxudulmaq.

**VAHİMƏLƏNDİRMƏ** "Vahimələndirmək"dən *f.is.*

**VAHİMƏLƏNDİRMƏK** *f.* Qorxuya salmaq, təşvişə salmaq, qorxutmaq. *Ümumiyyətlə, çoxdandı ki, xitabət kürsüsü Şamamanı vahimələndirmirdi*. Ə.Əbülhəsən.

**VAHİMƏLƏNMƏ** "Vahimələnmək"dən *f.is.*

**VAHİMƏLƏNMƏK** *f.* Qorxuya düşmək, qorxmaq, təşvişə düşüb narahat olmaq. *Telli yatmaq zamanı çatdıqda vahimələnməyə başladı*. S.Hüseyn. *Bir zamanlar təkcə gecələrin qaranlığından vahimələnən Ulduz, indi zülmət gecələrdə od püskürən topların üstünə bir sayğısızlıq*(*la*) *getməkdə idi*. Ə.Məmmədxanlı.

**VAHİMƏLİ** *sif.* Vahimə doğuran, ürəyə qorxu salan; dəhşətli, qorxunc, məşum. *Birdən əsəbi bir gülüş onun vahiməli çöhrəsinə bir həlimlik saçdı*. Çəmənzəminli. *Ara-sıra haradan isə vahiməli bayquş səsi gəlirdi*. M.İbrahimov. *Birdən qabaqdan vahiməli bir səs eşidildi*. Mir Cəlal.

**VAHİMƏSİZ** *sif.* Heç bir vahimə, qorxu olmadan; qorxusuz, qorxmadan.

**VAXMÍSTR** [*alm.*] Çar Rusiyası ordusunun süvari hissələrində kiçik zabit rütbəsi.

**VAXSEY** *nida, dan.* Dəhşət, müsibət, fəlakət, ruhi əzab və iztirab hisslərini bildirir. *Sara: – Vaxsey, ciyərin yansın! Kişi bilər, – deyə evə təpildi*. Mir Cəlal.

**VAXT** *is.* [*ər.* vəqt] 1. Cərəyan edən bir işin, hadisənin və s.-nin əsrlər, illər, saatlar, dəqiqələr, saniyələrlə ölçülən davam müddəti; zaman.

2. Saatların, günlərin, illərin ardıcıl surətdə bir-birini əvəz etməsi. *Vaxt nə tez gəlib keçdi.*

3. Bir hadisənin, işin baş verdiyi, baş verəcəyi, yaxud baş verməli olduğu an, moment. *İclasın vaxtını təyin etmək. – Vaxt yetişdi, anası .. rəhmətə getdi; Bu həsrətin ağrısını duydu Əmirxan*. S.Vurğun. *Müəllim kəndə vaxtından əvvəl qayıtdı*. S.Hüseyn. *Abbas vaxtından əvvəl açılmış bir çiçəkdir: o, ailə dolandırır*. S.S.Axundov. // Eyni mənada bəzən feillərdən sonra işlənir. *Kəramət uşaqlarını ancaq yatdıqları yerdə, yuxulu olduqları vaxt oxşayar, öpərdi*. Ə.Əbülhəsən. *Göyçək həyətin ortasında Tapdığı şirin gəzdirdiyi vaxt Qaçay işdən gəldi*. Ə.Vəliyev.

4. Dövr, zəmanə, çağ. *Çar hökuməti vaxtında. Keçmiş vaxtlarda. Müharibə vaxtı. Uşaqlıq vaxtı. Axır vaxtlarda. Bizim vaxtımızda* (*yaşadığımız dövrdə, bizim dövrümüzdə*). *– Vaxt bir vaxt idi ki, şəhərlərdə məktəb az tapılardı*. N.Nərimanov.

5. Günün, ayın, ilin, yaxud mövsümüm müəyyən çağı. *İstədiyin vaxtda gələ bilərsən. Gecənin bu vaxtında harada idin? – Əntiqə Hacının evinə gələndə yayın lap isti vaxtı idi*. Mir Cəlal.

6. Mövsüm. *Ov vaxtı. Ağac əkmək vaxtı. Xırman vaxtı.*

7. Əlverişli, münasib zaman; fürsət. *Hər şeyin öz vaxtı var. Vaxtdan istifadə etmək. İndi çimməyin yaxşı vaxtıdır. – Məsmə, dərdlərini Tahirzadəyə danışmaq üçün vaxt, fürsət axtarırdı*. Mir Cəlal. ☐ **Vaxt qazanmaq** – fürsət əldə etməyə çalışmaq. *Firidun .. hiss etdi ki, yoldaşları nə isə gizlədirlər. O vaxt qazanmaq üçün bir az da ləngidi*. İ.Şıxlı.

8. Boş saat, işdən azad zaman. *Gəlməyə vaxtım yoxdur. Vaxt olmadığına görə. Vaxtım olanda baxaram. Vaxt tapsan, bizə gəl.*

9. Möhlət. *Borcu qaytarmaq üçün vaxt vermək.*

10. Nida mənasında: **vaxtdır** – vaxtı çatmışdır. *Vaxtdır, evə getmək lazımdır.* – [Həsənqulu bəy:] *Balam, dəxi vaxtdır, gedək gəlini gətirməyə.* Ü.Hacıbəyov.

◊ **Vaxt gözləmir** – tələsmək lazımdır (təcili iş haqqında). **Vaxt keçirmək** – 1) vaxtını hədər yerə, səmərəsiz sərf etmək; 2) gün keçirmək, yaşamaq. *Nurəddin İmamverdi babanın yanında çox gözəl vaxt keçirirdi.* S.S.Axundov. [Zeynal] *hər zaman gülmək, əylənmək, çığırıb bağırmaq, gurultu qoparmaq, sərxoş olaraq səfahətlə vaxt keçirmək istəyirdi.* S.Hüseyn. **Vaxtı ilə** – bir vaxt, bir zaman; keçmiş zamanda, keçmişdə. *Vaxtı ilə o da səhnədə oynardı. Vaxtı ilə onun gözəl səsi var idi. Vaxtı ilə bura boş bir meydan idi.* – *Vaxtı ilə uzaq və amansız bir zəlzələ böyük və gözəl bir şəhəri yerlə yeksan etmişdi.* Ə.Məmmədxanlı. *İndi respublikamızda vaxtı ilə adi fəhlə olmuş yüzlərcə alim və mütəxəssislər, ixtiraçılar vardır.* İ.Əfəndiyev. **Vaxtını öldürmək** – vaxtını boş yerə, səmərəsiz sərf etmək. **Bəzi vaxt** – arabir, bəzən, hərdənbir. ..*Mən bəzi vaxt heç aydınlıq gecəni də o gölməçədən çıxmıram!* – *deyə beşinci atlı dilləndi.* S.Rəhimov. **Bir neçə vaxt** – b a x **neçə vaxt**. *Narıncın bir neçə vaxt başı dincəldi.* S.Rəhman. **Bir vaxt** – b a x **vaxtı ilə**. **Bir vaxtda** – eyni zamanda. **Bu vaxt** – bu anda, bu əsnada, indi. *Bu vaxt qonşusu Qumru qapını açıb içəri girdi.* Şamilov. **Heç (bir) vaxt** – əsla, qətiyyən, əbədа. **Hər vaxt** – həmişə, daima, hər zaman. **Neçə vaxt** – bir müddət, bir qədər zaman. *Neçə vaxt keçdi, günorta zamanı Mirzə Cavad şəhərdən gəldi kəndə.* Ə.Haqverdiyev. **O vaxt** – o zaman, onda. **Söz vaxtına çəkər** – haqqında söhbəti gedən keçmiş bir hadisənin zaman etibarı ilə həmin vaxtda baş verdiyini göstərmək üçün deyilir. *Söz vaxtına çəkər: aprelin əvvəlləri idi.* Mir Cəlal.

**VAXTA Kİ** b a x **vəqta ki**. *Kəsilmiş yolların dumandır, qardır; Vaxta ki bu hüdud, bu sərhəd vardır; Ömür dedikləri röyaya bənzər.* S.Vurğun. *Vaxta ki söz vermişdim, gərək sözümün üstündə duraydım..* S.Rəhimov.

**VAXTAMUZD** *sif.* [*ər.* vəqt və *fars.* muzd] *iqtis*. İşə sərf edilmiş vaxt hesabı ilə ödənilən və ya hesablanan. *Vaxtamuzd əmək haqqı.*

**VAXTAŞIRI** *sif.* və *zərf* Vaxtdan-vaxta, müəyyən vaxtlarda, müntəzəm surətdə. *Vaxtaşırı məlumat.* – *O ağ cövhəri isə bizim tərəflərə, dəmir yolundan uzaq kəndlərə vaxtaşırı günçıxandan gələn dəvə karvanları gətirirdi.* Ə.Məmmədxanlı.

**VAXTBAVAXT** *zərf* Vaxtdan-vaxta, müəyyən vaxtlarda. *Vaxtbavaxt yoldaşımla görüşürəm.*

**VAXT-BİVAXT** b a x **vaxtlı-vaxtsız**. [Qulu:] ..*Bu nə ömürdür mən keçirdirəm, gecə-gündüz, vaxt-bivaxt, sərbaz kimi bu evlərin keşiyini çəkirəm...* N.Vəzirov.

**VAXTDAN-VAXTA** *zərf* Arabir, bəzən, gah-gah, növbə ilə.

**VAXTINDA** *zərf* Münasib zamanda, lazımi vaxtda, müəyyən edilmiş vaxtda; nə tez, nə gec. *Hesabat vaxtında təqdim edilmişdir. Lap vaxtında gəlmisən.* – *Bağın nemətləri olduqca dən-dən; Əmirxan onları vaxtında dərdi.* S.Vurğun. *Vaxtında güllətək açılmayan söz; Sahibinə dəyər, hədəfə dəyməz.* X.Rza. // Qabaqcadan. *Tədbiri vaxtında görməli. Vaxtında hər şeyi nəzərdə tutmaq lazım idi.* – *Bəlkə bu halımdan incidi dağ-daş; Bunu öz vaxtında duya biləydim.* M.Araz.

**VAXTLI** *zərf* 1. Müddətli, müəyyən müddət üçün nəzərdə tutulmuş.

2. Münasib vaxtda, vaxtında, mövsümündə.

**VAXTLI-VAXTINDA** *zərf* Öz vaxtında, lazımi vaxtda, müəyyən edilmiş vaxtlarda; gecikmədən, gecikdirmədən, vaxtını gecikdirmədən. *İşi vaxtlı-vaxtında görmək. Xörəyi vaxtlı-vaxtında yemək lazımdır. Uşağı vaxtlı-vaxtında əmizdirmək.*

**VAXTLI-VAXTSIZ** *zərf* Hər vaxt, münasib və qeyri-münasib vaxtda. *Vaxtlı-vaxtsız gəlmək.* – *Nə görmüşəm bu dünyada hələ mən; Vaxtlı-vaxtsız bu dünyaya gələndən.* S.Tahir.

**VAXTSIZ** *sif.* və *zərf* 1. Vaxtı çatmadan, vaxtı çatmamış, vaxtından tez. *Vaxtsız banlayan xoruzun başını kəsərlər.* (Ata. sözü). // Çox tez. *Qanunsuz, qaydasız mübarizələr; Vaxtsız ölümlərdən gətirir xəbər.* S.Vurğun.

2. Yersiz, qeyri-münasib vaxtda, gec. *Vaxtsız gəlmək.* – *Vaxtsız qonaq kisəsindən yeyər.* (Ata. sözü).

3. Mövsümündə olmayan, mövsümündən əvvəl və ya sonra hasil olan. *Vaxtsız meyvə. Vaxtsız əkin bar verməz.*

**VAİZ** *is.* [*ər.*] *din.* Vəz və nəsihət edən, moizə edən. *Vaiz sözünə tutma qulaq, qafil olma kim; Qəflət yuxusunun səbəbi ol fəsanədir.* Füzuli. *Çıxmışkən günahı vaizin dizə; Vəz edib durmaqda, bax yenə bizə!* H.Cavid.

**VAİZLİK** *is. din.* Vaizin peşəsi, işi. *Molla Xəlil orucluqda vaizlik, məhərrəmlikdə rövzəxanlıq edər, başqa bir mollanın kəndə gəlməsini istəməzdi.* S.Hüseyn.

**VAKÁNSİYA** *is.* [*fr.*] İdarə və müəssisədə tutulmamış vəzifə yeri; boş yer.

**VAKS** [*alm.*] Dəri ayaqqabılara sürtmək üçün his, piy və mumdan hazırlanan qara rəngli sürtkü yağı.

**VAKSÍN** [*lat.*] *tib.* Yoluxucu xəstəliklərə qarşı müqavimət qüvvəsi yaratmaq üçün insan və ya heyvan bədəninə yeridilən tibbi preparat; aşı.

**VAKSİNLƏMƏ** *tib.* "Vaksinləmək"dən *f.is.*

**VAKSİNLƏMƏK** *f. tib.* Yoluxucu xəstəlikdən qorumaq üçün bədənə vaksin yeritmək, qoruyucu aşı vurmaq.

**VAKSİNLƏNMƏ** *tib.* "Vaksinlənmək"dən *f.is.*

**VAKSİNLƏNMƏK** *məch. tib.* Yoluxucu xəstəlikdən qorunmaq üçün bədənə vaksin yeridilmək, qoruyucu aşı vurulmaq.

**VAKSLAMA** "Vakslamaq"dan *f.is.*

**VAKSLAMAQ** *f.* Ayaqqabıya vaks sürtmək.

**VAKSLANMA** "Vakslanmaq"dan *f.is.*

**VAKSLANMAQ** *məch.* Ayaqqabıya vaks sürtülmək.

**VAKUÓL** *is.* [*fr.*] Heyvan və bitki hüceyrələrində, habelə birhüceyrəli orqanizmlərdə kiçik boşluq.

**VÁKUUM** [*lat.*] *fiz. tex.* Qapalı cihazın və ya qabın içərisində havanın, yaxud qazın seyrəlmiş vəziyyəti.

**VAQ** *təql.* Qurbağanın, ördəyin, qazın çıxardığı səs.

**VAQE** [*ər.*]: **vaqe olmaq** – 1) üz vermək, əmələ gəlmək, baş vermək, meydana çıxmaq. *Bu gün küçədə bir hadisə vaqe oldu. – Bəli, keçmişdə vaqe olan bir iş gələcək üçün dəsturüləməldir..* A.Bakıxanov. *Əhvalat vaqe olur İrəvan yaxınlığındakı şəhərlərdən birində.* C.Məmmədquluzadə; 2) yerləşmək, olmaq. *Yusif Sərracın dükanı şah məclisinin .. məşriq səmtində vaqe idi.* M.F.Axundzadə. **Vaqe olan** – baş verən hadisə. *Vaqe olanları düşünmək istədim, bacara bilmədim.* Çəmənzəminli.

**VAQİƏ** *is.* [*ər.*] 1. Yuxu. *Bu işlərin hamısı mənə vaqiə kimi göründü.* C.Məmmədquluzadə. [Nurcahan:] *Xanım, başına dönüm, mən bu gecə bir vaqiə görmüşəm.* N.Vəzirov. *Oğlan oyuna bir mərtəbədə aludə olmuşdu ki, gecə vaqiədə də oyundan sayıqlayırdı.* Ə.Haqverdiyev.

2. Hadisə, əhvalat, macəra. *Ol vaqiədən olub xəbərdar; Tutdu rəhi-dəşt Zeydi-qəmxar.* Füzuli. *Bu vaqiədən xatirə olmaq üçün pələngin dərisini soyub evə gətirdim.* A.Şaiq.

**VAQİƏN** *ara s.* [*ər.*] *klas.* Həqiqətən, həqiqətdə, doğrudan da. *Xacə Mübarək vaqiən çox saf və sadiq adam idi.* M.F.Axundzadə. *Vaqiən, İranın mehmannəvazlığının mislini qeyri yerdə, zənn edirəm, görmək olmaz.* C.Məmmədquluzadə. *Vaqiən, Əsgər Züleyxanı çox incidirdi.* C.Cabbarlı.

**VAQİF** *sif.* [*ər.*] Bir işdə məlumatı, biliyi olan; xəbərdar, məlumatlı. *Mirzə ən qədim Şərq elmlərindən başlamış öz gününə qədər bütün elmlərə vaqif idi.* S.Rəhimov. ☐ **Vaqif olmaq** – aşna olmaq, xəbərdar olmaq, məlumatı olmaq, bilmək. *Nədir halın kim, olmazsan özündən vaqif, ey zail!* Nəsimi. [Ay] *da Vaqif kimi eşq yorğunu olaraq, təpələr arxasından sönük çöhrəsi ilə aləmə tamaşa edir, sevgi üzüntülərinin sirrinə vaqif ola bilmirdi.* Çəmənzəminli. *Bu adamın hər sözündə, hər hərəkətində öz işini yaxşı bilən .. və gələcəkdə nələr görüləcəyinə yaxşı vaqif olan bir adamın təmkini və sakitliyi vardı.* Ə.Sadıq.

**VAQQILDAMA** "Vaqqıldamaq"dan *f.is.*

**VAQQILDAMAQ** *f.* Qurbağa, ördək, qaz, bayquş səsinə bənzər səs çıxarmaq. *Vaqqıldama bayquş kimi, idbar, dilənçi!* M.Ə.Sabir. [Bayquş] *həmişə uçuqlar aləminə seyrə çıxar, vaqqıldar, buradan da dünyanın zövqünü alar.* S.Rəhimov.

**VAQQILDATMA** "Vaqqıldatmaq"dan *f.is.*

**VAQQILDATMAQ** *icb.* Vaqqıldamağa məcbur etmək, vaqqıltı səsi çıxartdırmaq.

**VAQQILTI** *təql.* Qurbağa, ördək, qaz, bayquş səsinə bənzər səs. [Şahməmmədin]

*səsində bir bayquş vaqqıltısı duyulurdu; danışdımı, adamı qorxu hissi bürüyürdü.* Çəmənzəminli. [Əntərzadə:] *Musiqi əvəzinə qurbağaların vaqqıltısını eşidirəm.* Mir Cəlal.

**VAQÓN** [*ing.*] 1. Rels üzərində hərəkət edən minik və ya yük daşıyan üstüörtülü və ya açıq araba. *Dəmiryol vaqonu. Motorlu vaqon. Yük vaqonu. Yataqlı vaqon. – Qaraca qız yolu getdiyi zaman ayağı büdrəyib yıxıldı və moruğu yerə töküldü. Bunu yığan vaxt vaqon qatarı göründü.* S.S.Axundov. *Keçən ilin yayında Səkinə Buzovnadan bibisi evinə qayıdırdı. Vaqonlarda basabas idi.* Mir Cəlal. ☐ **Vaqon-restoran** – dəmiryol qatarında restoran üçün ayrılmış xüsusi quruluşlu vaqon.

2. Rəqəmlərlə – vaqonda yerləşən yükün miqdarı. *Bir vaqon kömür. – Keçən il qurulan ianə komissiyası qırx beş min manatdan ancaq iki vaqon un göndərdi Zəngəzura.* C.Məmmədquluzadə.

**vaqon-vaqon** *zərf* Vaqonlarla. *Ölkənin çöllərində pambıq yığılır ton-ton; Buraya göndərilir durmadan vaqon-vaqon.* S.Rüstəm.

**VAQONÇA** *kiç.* Yaxın məsafələrə yük daşımaq üçün üstüaçıq kiçik vaqon. *Torpaq əl arabası ilə və ya vaqonçalarla daşınır.*

**VAQONÉT(KA)** [əsli *ing.*] b a x **vaqonça**. [Ağabala] *maşını növbədənkənar irəliyə, vaqonetkalar ağzına verib xahiş etdi..* Mir Cəlal.

**VAQONETSÜRƏN** *is.* Vaqoneti idarə edən fəhlə.

**VAQONQAYIRAN** *sif.* və *is.* Vaqon qayırmaqla məşğul olan. *Vaqonqayıran zavod.*

**VAQONQAYIRMA** *sif.* Vaqonqayırma sahəsinə aid olan. *Vaqonqayırma sənayesi.*

**VAQONQOŞAN** *is. d.y.* Vaqonları birbirinə qoşub qatar düzəldən dəmiryol işçisi.

**VAQONSÜRƏN** *is.* Tramvay, yaxud elektrik dəmiryolu motorlu vaqonunun hərəkətini idarə edən işçi.

**VAQRANKA** *is.* [*rus.*] Zavodlarda çuqun əritmək üçün soba.

**VAL** [*rus.*] 1. Müxtəlif maşınlarda: öz oxu ətrafında fırlanan silindr. *Dəzgahın valı.*

2. Qrammofon və ya patefonda çalınmaq üçün xüsusi üsullarla üzərinə səs yazılmış yastı çarx; plastinka. *Firuzə .. quş kimi yüngül bir hərəkətlə qalxıb, balaca yeşiyin üstündəki patefona bir val qoydu.* İ.Əfəndiyev. *Gülüş anasının sözünü sındırmadan, patefona val qoydu.* Ə.Vəliyev.

**VÁLA** *sif.* [*fars.*] *klas.* Yüksək, uca, ali. [Dərviş:] *Babam heyrət, anamdır şübhə .. əsla; Bilinməz mən kiməm, ey şeyxi-vala!* H.Cavid.

**VALÁ** *is. məh.* Çox sıx ələk. // Çox sıx tor. *Yaşmağı valadan, dili laladan; Ağ nazik əllərin xınası gözəl.* Aşıq Həsən.

**VALAY** [*rus.* "валяй" sözündən] *dan.* Adətən **valay vurmaq** şəklində işlənir – səndələmək, yeriyərkən o tərəf-bu tərəfə yırğalanmaq.

**VALAYLA(N)MA** "Valayla(n)maq"dan *f.is.*

**VALAYLA(N)MAQ** *f.* [*rus.* "валяй" sözündən] *dan.* b a x **valay vurmaq** ("**valay**"da). *Çadra havada bir-iki kərə yellənib valaylandıqdan sonra, yerə düşdü.* S.Hüseyn.

**VALEH** [*ər.*] Heyran, məftun, vurğun; heyran olmuş, məftun olmuş, vurulmuş. *Mən bu yerlərin gözəlliyinə valehəm. – Hamı bu halə valehü məftun; Nagəhan hadis oldu bir yanğun.* M.Ə.Sabir. ☐ **Valeh etmək** – heyran etmək, məftun etmək. *Qulaq asanları valeh etmək mənə .. qismət deyilmiş.* C.Məmmədquluzadə. *..Bir tərəfdən də baharın xoş mehi insanı valeh edirdi.* S.S.Axundov. *Günəşin batması ilə tez-tez üfüqlərdə dəyişən rənglər..* [Dilaranı] *valeh etmişdi.* M.İbrahimov; // *məc.* məst etmək mənasında. *Həyati götürən soğan, qovurma, zəfəran iyi adamı valeh edirdi.* Mir Cəlal. **Valeh olmaq, valeh qalmaq** – heyran olmaq, məftun olmaq, vurulmaq. *Göygölün gözəlliyinə insan valeh olur. – Surətin nəqşində insan valehü heyran olur.* Nəsimi. [Bədircahan:] *Ağa, o qədər səndən dedim ki, .. az qaldılar valeh olsunlar.* N.Vəzirov. [Bünyad] *təpədən dırnağa qədər ipək içində olan bu gözəl qıza valeh olmuş kimi baxırdı.* Ə.Əbülhəsən.

**VALEHEDİCİ** *sif.* Valeh edən, məftun edən; öz gözəlliyi, təravəti və s. ilə insana özünü unutduracaq dərəcədə nəşə və zövq verən. *İnsanı valehedici mənzərə.* – [Mehman] *özünün güclü məntiqi, valehedici nitqi ilə hamını heyran etməyə başlayırdı.* S.Rəhimov.

**VALEHLİK** *is.* Heyranlıq, məftunluq; vurğunluq; heyran olma, valeh olma; valeh olmuş adamın halı.

**VALÉNT** [*lat.*] *kim.* Kimyəvi elementin neçə atom və ya qrupla birləşə bildiyini göstərən kəmiyyət.

**VALENTLİK** *is. kim.* Atomun müəyyən miqdar digər atomlarla birləşə bilmək qabiliyyəti.

**VALERİYÁN(KA)** [*rus.*] *tib.* Pişikotu kökündən hazırlanan, ürək və sinir sistemi fəaliyyətini nizama salan damcı dərman.

**VALÉT** [*fr.*] Qumar kağızlarında: üzərində silahlı adam şəkli olan kart; soldat.

**VALİ** *is.* [*ər.*] 1. Keçmişdə: vilayət hakimi, bir vilayəti idarə edən vəzifəli şəxs. *Hicri 296-cı ildən 306-cı ilə qədər Şirvan da Azərbaycan və Ermənistan valisi Əbülqasım Yusifin hökmü altında idi.* A.Bakıxanov. [İranın] *hər vilayətində cəlal sahibi, uca mərtəbədə bir vali hökmran oldu.* "Qarabağnamə".

2. Bax **qubernator**. *Maşaallah, gecəgündüz valimiz; Çalır partapiyan, oynayır bilyard.* Q.Zakir.

**VALİD** *is.* [*ər.*] *klas.* Ata. *Ey millətin ümmidi, dilü canı uşaqlar! Validlərinin sevgili cananı uşaqlar!* M.Ə.Sabir.

**VALİDEYN** *is.* [*ər.*] Ata və ana, ata-ana. *Valideynə hörmət. Valideyn şurası* (*bir məktəbdə oxuyan uşaqların ata-analarının müşavirəsi, şurası*). – *Valideynin, təbii, övlada; Nəzəri-etinası tərbiyədir.* M.Ə.Sabir. *Valideynlərindən bu vaxta qədər heç nəyi gizlətməyən Lətifə yalan deməmək üçün cəld addımlarla qapıya yanaşdı.* M.Hüseyn. *Gəray bircə baxışda onların valideyn dərdinin böyüklüyünü gördü.* Ə.Əbülhəsən.

**VALİDEYNLİK** *is.* Valideyn vəzifəsi, işi, münasibəti.

**VALİDƏ** *is.* [*ər.*] Ana. *Doğar insan ata ocağında; Bəslənir validə qucağında.* M.Ə.Sabir. *Olsun gərək də validə canpirə rəhbəri.* M.Hadi.

**VALİDÓL** *is.* [*lat.*] *tib.* Mərkəzi sinir sistemini sakitləşdirən, damargenəldən dərman preparatı.

**VALİHANƏ** *zərf* [*ər.*] *şair.* Valeh olmuş bir surətdə, özünü itirmiş bir halda, heyrancasına.

**VALİLİK** *is.* 1. Vali vəzifəsi. *Sultan Əhməd Cəlayir Bağdada gəlib, Əmir Teymurun nəvəsi Əbubəkir Mirzəni valilikdən çıxartdı.* A.Bakıxanov.

2. Bir valinin idarəsi altında olan yerlər.

**VALLAH(İ)** *nida* [*ər.*] Allaha and olsun (inandırmaq üçün deyilir). *Mən eylədiyim məkri şəyatin də bacarmaz; Vallah və billah!* M.Ə.Sabir. *Vallahi, Ağa dərviş, mən .. incimƏzdim, hərgah əvvəlinci günü aşkar mərdmərdanə mənə məlum edəydilər ki, asudə yer yoxdur, get.* N.Vəzirov. // Ümumiyyətlə, inandırmaq üçün işlənən ifadə. [Eldar:] *Vallah, düz deyirəm, pələngsən, pələng!* S.Vurğun. [Turac:] *Vallah, səndə böyük hövsələ var.* İ.Əfəndiyev.

**VALOKORDÍN** *is. tib.* Korvalolla eyni qəbildən olan ürək dərmanı.

**VALS** [*fr.*] 1. İki nəfərin birgə oynadığı Avropa rəqslərindən birinin adı. *Vals oynayan oğlan və qızlar bir-iki-üç, bir-iki-üç sayı ilə fırlanırlar.* Ə.Bədəlbəyli.

2. Bu rəqs üçün yazılmış musiqi əsəri. *Mərmər sütunlu sarayın qabağındakı meydançada orkestr vals çalırdı.* M.İbrahimov.

**VALTÓRN(A)** [*alm.*] *mus.* Buynuz şəklində olan, nəfəslə çalınan müştüklü musiqi aləti. *Nəfəsli musiqi alətləri əsas etibarilə üç qrupa ayrılır: ..2. Misdən hazırlanmış nəfəsli alətlər* (*truba, valtorn, trombon, tuba və sairə*). Ə.Bədəlbəyli. *Trombonla valtornanın güclü nəfəsi; Ordu kimi hücum çəkir mübarizəyə.* S.Vurğun.

**VALUN** *is.* [*rus.*] Çay daşı, qaya parçası.

**VALYÓR** *is.* [*fr.*] Boyakarlıq və qrafikada tonun rəng çalarlığı.

**VALYÚTA** [*ital.*] 1. Bir ölkədə qəbul olunmuş pul sisteminin əsasını təşkil edən pul vahidi (manat, dollar, frank və s.).

2. Xarici dövlətlərin pulları.

**VAM**[1] Adətən **vamla** şəklində: zəif od üstündə aramla, yavaş-yavaş, asta-asta. *Vamla bişmək.* ☐ **Bir vamda** – bir qaydada, bir üsulda. *Günlərimiz bir vamda keçmədi, yaxşısı da oldu, pisi də.* R.Rza.

**VAM**[2] *is.* [*fars.*] Borc qaytarılmaq şərtilə alınan pul və ya şey.

**VAMPİR** *is.* [*fr.*] 1. Qaniçən, zülmkar.

2. *zool.* Yarasalar dəstəsinin yastıburun yarasalar fəsiləsindən məməli heyvan cinsi.

**VAMÜSİBƏTA** *is.* [*ər.*] Bir bəla, müsibət üz verdikdə işlədilən nida – fəryad, fəğan, şivən. *Evdə vamüsibəta qopdu.*

**VANÁDİUM** [*lat.*] Kimyəvi element, əla polad hazırlanmasında işlədilən çox bərk gümüşü ağ metal. *Ayrı-ayrı kimyəvi elementlərdən isə alüminium, vanadium, sürmə .. və radioaktiv metalların yeni yataqlarının axtarışı xüsusi əhəmiyyət kəsb edir*. M.Qaşqay.

**VANDÁL** [*lat.*] 1. Roma imperiyasının bir hissəsini işğal və Roma şəhərini dağıdıb talan etmiş qədim alman qəbiləsi.

2. Vəhşi, mədəniyyətsiz; mədəniyyət əsərlərini vəhşicəsinə dağıdan, məhv edən adam.

**VANDALİZM** [*lat.*] Mədəniyyət əsərlərini vəhşicəsinə dağıtma, məhv etmə; vəhşilik.

**VANƏFSA** *is.* [*ər.*] Fəryad, fəğan, şivən, qışqırıq. *Bir qışqırıq, bir vanəfsa qopdu ki, gəl görəsən*. "Kirpi".

**VANİL** [*fr.*] Tropik bir bitki və bu bitkinin ədviyyat kimi işlənilən qurudulmuş ətirli meyvəsi. *Vanil sarmaşan bitki olub, Cənubi Amerikanın tropik meşələrində yayılmışdır.* Əliyev.

**VANİLLİ** *sif.* Tərkibində vanil olan; vanil qatılmış. *Vanilli bulka.*

**VÁNNA** [*alm.*] 1. İçində çimmək və ya şey yumaq üçün uzunsov böyük ləyən, qab. [Həkim:] *Uşağın özü çox zəif və bədəni də çirklidir, ..hələliyə nə hamama göndərmək və nə də vannaya salmaq olmaz*. S.S.Axundov. // Xüsusi terminologiyada *tib*.: **ayaq, qol və s. vannası** – müalicə məqsədi ilə ayaqları, qolları mayeyə salmaq üçün xüsusi qab. // *xüs.* İçinə maye tökmək üçün müxtəlif formalı qab. *Foto vannası.*

2. Müalicə məqsədi ilə içi su ilə dolu vannadan istifadə prosesi. *Vanna qəbul etmək. Həkim mənə on vanna yazmışdır. Vannanı tox qarına qəbul etmək olmaz.*

3. Bədənin dəniz suyu, hava, günəş şüaları, müalicə palçıqları təsiri ilə müalicəsi, bərkidilməsi. *Dəniz vannası. Günəş vannası. – Kəndin bütün ətrafını aradım; ancaq burada bir parça qumlu yer tapdım, soyunub uzandım; günəş vannası alırdım, – deyə, doktor izahat verdi.* B.Talıblı.

**VANNALI** *sif.* Vannası olan, hamamxanası olan. *Üçotaqlı vannalı mənzil.*

**VANT** *is.* [*holl.*] Dor ağacını və başqa şeyləri gəminin bortlarına bərkitmək üçün takelaj ipləri.

**VAPÓR**[1] [*lat.* "buxar" sözündən] Buxar gəmisi, paroxod. *Alış-verişçiləri Mavərayibəhri-Xəzərdə; Vaporların malın alıb-satanda görməli imiş.* M.Ə.Sabir.

**VAPÓR**[2] *is.* [*lat.*] Neftdən alınan, özlülüyü yüksək sürtkü yağı.

**VAR**[1] 1. *sif.* Olan, mövcud olan. *Var qüvvə ilə çalışmaq. Var gücünü sərf etmək.* ☐ **Var gücü (qüvvəsi) ilə** – bütün qüvvəsini gərginləşdirərək, sərf edərək. *Var qüvvəmizlə işləməliyik. – Elə bu zaman maşından düşən zurnaçılar ordlarını doldurub, var gücləri ilə piləməyə başladılar.* "Kirpi".

2. *is.* Varlıq, mövcudiyyət. *Ahü zar çəkməkdən yox olub varı; Saf aynası tutub möhnət qubarı.* Q.Zakir. *O dəhən fikri ilə cümlə yox oldu varım.* S.Ə.Şirvani. ☐ **Var olmaq** – mövcud olmaq, yaşamaq.

3. Xəbər mənasında (**vardır** şəklində də işlənir). *Var bir tədbiri, amma aşikar etməz mana*. Füzuli. [Bayram:] *A kişi, ov da ələ düşmür, nə bir ceyran var, nə bir turac var.* M.F.Axundzadə. *Həmişə dildə sənin solmayan baharın var.* S.Ə.Şirvani. *Burada gecələrin qərib səsi var.* S.Vurğun. *Mən çəlik ürəkli bir yeni gəncəm; Dildən-dilə düşdüm, hekayətim var.* M.Müşfiq. *Bununla bərabər* [Nəsir] *burasını da düşünərdi ki, arxasında Mirzə Qədir kimi bir qardaşı vardır.* S.Hüseyn. // Olar, yaxındır. *Möcüzələr yaradır ana ürəyi; Bir il var yaradır ana ürəyi.* S.Rüstəm.

4. Birinci şəxs sonluğu ilə: **varam** *dan*. – 1) çox xoşuma gəlir, bəyənirəm, ürəyimə yatır. *Varam onun oxumağına. Varam sənin oyununa.* – [Bəbir bəy:] *Amma mən sənin kimisinə varam. Kasıbsan, üzüyolasan, işləyənsən*. Mir Cəlal; 2) hədə mənasında. [İblis:] *Mən də nə qədər dünya durub, o insanın nəsli ilə varam*. Ə.Haqverdiyev.

5. Sual şəkilçisi ilə: **varmı?** – mövcuddurmu?, tapılarmı? *Gülşəni-aləmdə bir gül varmı bixar olmasın?* M.Hadi. ☐ **Var olsun!** (*nida*) – yaşasın, həmişə baqi olsun. *Var olsun azad yurdun azad oğulları!* C.Cabbarlı. *Mən deyirəm, qoy var olsun sinəndəki el ürəyi!* S.Vurğun. *Var olsun cəlalın, ey Azərbaycan!*

*Ey Odlar ölkəsi, günəşli diyar!* Ə.Cəmil. **Var etmək** – yaratmaq, vücuda gətirmək, meydana gətirmək. *Hüsnübəyim üzünü göyə tutub deyir: – Ey bizi heçdən var eləyən xaliq, səndən savayı pənah yerim yoxdu.* İ.Məlikzadə. **Nə var, nə yox?** – yeni xəbər sorğusu. *Balam, necəsən?! Söylə, nə var, nə yox bizə Gəncədən?* M.Müşfiq. **O ki var (idi)** – lazımi qədər, istədiyin qədər; çox, çoxlu, lap çox. *O ki var dedim. O ki var yedi. – Dünyagörmüş dayı bacısı oğlunun sözündən o ki var qarnını tutub güldü.* “Kirpi”.

**VAR²** *is.* Dövlət, sərvət, mal-mülk. *Varından keçmək. Varını sərf etmək. Onun varı çoxdur. – Varını verən utanmaz.* (Ata. sözü). *Varı möhnətdir cəhanın, nə umarsan, ey könül! Lənət olsun bu cəhanə, həm cəhanın varına!* Nəsimi. *Mərd olanlar keçər külli-varından.* M.V.Vidadi. *Cəhanə tərk edərəm cümlə dövlətü varı.* Natəvan. *Aldada bilməmiş dünyanın varı; Bir məslək eşqilə yaşayanları.* S.Vurğun.

**VARAN** *is.* Kərtənkələlər yarımdəstəsindən sürünən heyvan fəsiləsi.

**VARAVURD** *is. dan.* Götür-qoy eləmə, çox ölçüb-biçmə, hərtərəfli düşünmə. [Yusif] *çox varavurddan sonra axırda bu fikrin üstündə dayandı və ən çətin bir məsələni həll edən tələbə kimi sevindi.* Ə.Vəliyev. ☐ **Varavurd etmək (eləmək)** – b a x **varavurdlamaq**. *Qonaqlar getdilər, padşah düşdü fikrə, vəzir varavurd eləyib gördü ki, padşah çox fikirdədi.* (Nağıl). [Salavat] *Qulama qəfilcə qəbul etdiyi qərarını bir də soyuqqanlılıqla yoxlayıb, varavurd etmək imkanını verdi.* Ə.Əbülhəsən.

**VARAVURDLAMA** “Varavurdlamaq”dan *f.is.*

**VARAVURDLAMAQ** *f. dan.* Götür-qoy eləmək, ölçüb-biçmək, hərtərəfli düşünmək; istiqamətini müəyyən etmək, bələdləmək. *Yolu varavurdlayan kapitan durbini gözündən endirərək, qarşıda sıxlaşan adamlara səslənirdi.* Mir Cəlal.

**VARDIRILMA** “Vardırılmaq”dan *f.is.*

**VARDIRILMAQ** *məch.* Çatdırılmaq.

**VARDIRMA** “Vardırmaq”dan *f.is.*

**VARDIRMAQ** *f.* Çatdırmaq.

**VAR-DÖVLƏT** *is.* Sərvət, dövlət, var, mülk-mal. [Gülsənəm:] *Kişi gecə-gündüz əlləşir, kolxozun varını-dövlətini göz bəbəyi kimi qoruyur.* M.Hüseyn.

**VARƏSTƏ** *is.* [*fars.*] Xilas olmuş, azad.

**VAR-GƏL: var-gəl etmək (eləmək)** *dan.* – gəzinmək, o başa-bu başa getmək. *Xan çıxdı balkona və bir papiros yandırıb başladı var-gəl eləməyə..* C.Məmmədquluzadə. *Salam ayağa qalxıb kabinetdə var-gəl eləməyə, pəncərədən payız yağışına baxmağa başladı.* Mir Cəlal.

**VARILMAZ** *sif.* Gedib çıxmaq mümkün olmayan, əlçatmaz.

**VARİANT** [*lat.*] 1. Bir şeyin başqa bir şəkli. // Bir planın, layihənin və s.-nin başqa şəkildə tərtibi, işlənməsi. *Layihənin variantları. Planın ilk variantı vardır.* – [Rəssam:] *Yoldaş Əlyarov, mən tərtibat verəndə azı on-on beş variant düzəldirəm.* M.Hüseyn.

2. Hər hansı bir ədəbi, bədii, musiqi və s. əsərin, yaxud onun bir hissəsinin müxtəlif redaksiyalarından birisi. “*Qaçaq Nəbi*” *dastanının Azərbaycanda bir neçə variantı vardır.*

**VARİÁSİYA** [*lat.*] 1. *mus.* Əsas musiqi mövzusunun, onun ayrı-ayrı elementlərini (ritm, harmoniya və s.) dəyişdirmək yolu ilə başqa şəklə salınması. “*Vilayəti*”*nin birinci cümləsi variasiya şəklində təkrar olunmasını tələb edir.* Ü.Hacıbəyov. *Adından bəlli olduğu kimi, variasiya tərzində yazılmış əsərlərdə müəyyən bir melodiya* (*tema*) *sonradan müxtəlif surətdə başqa şəkildə dəyişdirilərək, hər dəfə yeni bir variantda ifadə edilir.* Ə.Bədəlbəyli. // Cəm şəklində: **variasiyalar** *mus.* – əsas mövzunun təkrarından və müxtəlif şəkildə işlənməsindən ibarət musiqi əsəri, rəqs və s.

2. *biol.* Təbii və ya süni şərait təsiri altında heyvanların və ya bitkilərin öz əsas tipindən kənara çıxması, bir qədər dəyişməsi. *Oxşar heyvanların cütləşdirilməsi faydalı variasiyaları cütləşdirməkdən əlavə, bir də bu variasiyaları nəslə mümkün qədər daha yaxşı vermək qabiliyyətini heyvanlarda təlim etmək məqsədini güdür.* “Ümumi zootexniya”.

**VARİD** [*ər.*]: **varid olmaq** – çatmaq, yetişmək, girmək, daxil olmaq. [Dostəli:] *Ağa dərviş, görünür ki, sən buraya təzə varid olubsan.* Ü.Hacıbəyov. [Dərviş:] *Hamımız qoca kişi ilə bir yerdə kənddən əlvida edib, şəhərimizə varid olduq.* A.Divanbəyoğlu.

**VARİDAT** *is.* [*ər.*] Bir müəssisənin, idarənin və ya şəxsin bütün gəliri, mədaxili. *Mağazanın varidatı.* – *Ədliyyə məmuru gəlib mərhum Ağaheydərdən qalan varidatı siyahıya alıb.* N.Vəzirov. [Sərhəng] *Şəmsiyyədən başqa öz övladı olmayan bu qoca tülkünün varidatına varis qalacağını düşünməyə başlayırdı.* M.İbrahimov.

**VARİS** *is.* [*ər.*] 1. Bir şəxsin ölümündən sonra, yaxın qohumluq və ya vəsiyyət yolu ilə onun var və mülkünə sahib olan adam; vərəsə, xələf. *Mərhumun varisləri bir-birinin üzünə baxıb .. pulları verirlər.* Ə.Haqverdiyev. ☐ **Varis olmaq** – varislik yolu ilə sahib olmaq, yiyələnmək. [Səkinə xanım:] *Qardaşımın övladı yoxdur ki, puluna varis ola.* M.F.Axundzadə.

2. İrs olaraq ata-anasından, nəslindən bir xassə, bir şey almış adam və ya heyvan. *Təbiətdə irsiyyətin xüsusiyyəti miras və varisdə olduğunun eynidir.* “Ümumi zootexniya”.

3. *məc.* Bir işi davam etdirən; davametdirici, davamçı. *Təyyarəçi olmaq, yəni döyüş ənənələrinin varisi və davametdiricisi olmaq böyük şərəfə nail olmaq deməkdir.* – [Qara] *ənənələrin qulu deyil, həqiqi varisidir.* R.Rza.

**VARİSLİK** *is.* Bir adamın ölümündən sonra yaxın qohumluq və ya vəsiyyətə görə onun malına, mülkünə və s.-yə sahib olma hüququ. [Xəlifə Nəsirəddinbillahın Qızıl Arslana məktubundan] *..Xəyanətiniz nəticəsində siz Eldəniz xanədanı tərəfindən sahibləndiyiniz varislik haqqından məhrum edilə bilərsiniz.* M.S.Ordubadi.

**VARİSSİZ** *sif.* Varisi olmayan.

**VARİSSİZLİK** *is.* Varisi, vərəsəsi olmama, vərəsəsizlik.

...**vari**. Sifətlərin axırına gətirilərək, oxşarlıq, bənzərlik bildirir; məs.: dalğavari, halqavari və i.a. // Eyni mənada bəzən adam adlarına da əlavə edilir; məs.: Füzulivari, Vaqifvari və s.

**VARİYYAT** *is.* Mal, dövlət, var. *Molla sonbeşik Salehdən bəri başdan xeyli variyyat qoparıb evinə yolladı.* S.Rəhimov.

**VARLANDIRMA** “Varlandırmaq”dan *f.is.*

**VARLANDIRMAQ** *f.* Varlı etmək, mal-dövlət sahibi etmək, dövlətləndirmək.

**VARLANMA** “Varlanmaq”dan *f.is.* [Almaz:] *Bizə tək-tək adamların varlanması lazım deyildir. Gərək ellik varlansın, cəmiyyət varlansın.* C.Cabbarlı.

**VARLANMAQ** *f.* Var-dövlət sahibi olmaq, sərvətə malik olmaq, varlı olmaq. *Nurcabbar var-dövlətə də, varlanmaq ehtirası ilə özünü oda-közə vuranlara da ikrahla baxırdı.* İ.Məlikzadə.

**VARLI** *sif.* Dövlətli, sərvətli, bolluq və rifah içərisində yaşayan. *Varlı yaşayış. Varlı həyat uğrunda. Varlı təsərrüfat.* // İs. mənasında. *Varlılar və yoxsullar.* – *Varlıların çoxu özlərini və mədənlərini qorumaq məqsədi ilə yanlarında qoçu saxlayırdılar.* A.Şaiq.

**VARLI-HALLI** bax **varlı**. *Varlı-hallı adam.* – *Bu kişi varlı-hallı bir adam idi.* Ə.Haqverdiyev.

**VARLI-KARLI** *dan.* bax **varlı-hallı**. [Pərzad:] *Varlı-karlı kişidir, niyə verməyək?* Mir Cəlal.

**VARLIQ** *is.* 1. Olma, var olma, mövcud olma; mövcudiyyət (*yoxluq* ziddi). *Məhəbbət özü də canlı həyatdır; Onun varlığını yaşayan duyur.* S.Vurğun. “*Sual*” *romansında çoban həyatını, gözəl mənzərələri təsvir edən Asəf Zeynallı xoş və gözəl təbiət qucağında yaşayan insan varlığındakı mənanı oxşayır.* Ə.Bədəlbəyli.

2. *fəls.* Şüurdan asılı olmayaraq mövcud olan hər şey – maddə, maddi aləm, təbiət.

3. *məc.* Həqiqətdə mövcud olan şeylər, təbiət, aləm, dünya, kainat, bütün mövcudat. *Varlığa güldükcə o nazlı bahar; Çiçəklər, qönçələr açır hər dilək.* S.Vurğun. *Bütün varlıq, bütün kainat sanki yenidən varlanır, yenidən səslənir .. onun* [şairin] *gözündə işıqlanırdı.* Ə.Məmmədxanlı. // *məc.* Real aləm, real həyat, ictimai mühit. [C.Məmmədquluzadə] *xəyalata uyan, idealların gözəlliyi ilə yaşayan, varlığa tül pərdələr dalından baxan yazıçılardan deyildi.* M.İbrahimov.

4. *məc.* Həyat, həyat mənbəyi mənasında. *Bu torpaqdır varlığımın mayası; Bu torpaqda alın təri tökmüşəm.* S.Rüstəm.

5. *məc.* Qüvvət, güc, səy, cəhd mənasında. [Firidun] *yalnız fəaliyyətdə, yalnız çalışmaqda bir təskinlik taparaq, bütün varlığını yenidən dərslərə və işə vermişdi.* M.İbrahimov.

☐ **Bütün varlığı ilə** – 1) var gücü ilə, ciddiyyətlə. *Mənim dövlətimdir, mənim varımdır; Bütün varlığımla sevə bilməyim.* B.Vahabzadə; 2) bütün təfərrüatı ilə, bütün incəlikləri ilə, olduğu kimi. *Ana qəlbini bu dünyada hansı sənətkar bütün varlığı ilə təsvir etmişdir.* S.Rəhimov.

6. Bolluq, rifah. *Varlığa nə darlıq.* (Ata. sözü).

7. Vücud, bədən mənasında. *Təliənin bütün varlığı titrədi və qız qorxdu.* M.S.Ordubadi. *Onun gözəlliyi, incə varlığı; Duyan ürəklərə lərzə salırdı.* S.Vurğun. *Bütün varlığında bir ağrı gəzdi; Az qaldı mənliyi alışıb yana.* M.Rahim.

**VARLILIQ** *is.* Maddi cəhətdən iqtidarlılıq, maddi rifah, varı-dövləti olma; dövlətlilik; varlı adamın halı. *Varlılığa tələsən yoxsulluğa tez düşər.* (Ata. sözü).

**VARMA** "Varmaq"dan *f.is.*

**VARMAQ** *f.* 1. Getmək, yetişmək, çatmaq, gəlmək, gəlib çatmaq. *İstərəm kim, varayım kuyinə yüz qovğa ilən.* Kişvəri. *Leyli onun olsun, eylədim əhd; Var, indi sən et əlacına cəhd.* Füzuli. *Səba, əhvalımı bir-bir; Varıb ol yarə ərz eylə.* M.V.Vidadi. *Səba, var, kuyidildarə söylə kim, növbahar olmuş.* Heyran xanım. ☐ **Varıb getmək** – çıxıb getmək, rədd olmaq. *Ellik, yerbəyerdən qalxıb dedilər: – Güloğlan, sazını vur qoltuğuna, var get.* "Aşıq Qərib".

2. Nəticələnmək, müncər olmaq, nəhayətlənmək, çatmaq. [Gülüş:] *Ay Sevil, artıq oyun sona varmaqdadır, çox çəkməz, sən özün görərsən.* C.Cabbarlı.

3. *məc.* Dalmaq, qərq olmaq, getmək. *Gəl duraq yanaşı, xəyala varaq; Bizə layla desin suların səsi.* S.Vurğun.

**vara-vara** *zərf* Getdikcə. *Vara-vara oldun zalim, bimürvət; Əzəldən yox idi bu güman sənə.* Q.Zakir

**VARNA** *is.* [*sanskr.*] Qədim Hindistanda mövcud olmuş 4 zümrədən hər biri: brahmanlar, kşatrilər, vayşilər, şudralar.

**VARSAĞI** *is. qəd.* Varsaqların ifa etdikləri hava; şeir. *Türkmən şairlərinin .. qoşmalarını, varsağılarını bilməmək, öyrənməmək bizim üçün böyük bir nöqsan ədd oluna bilər.* S.Mümtaz.

**VARSAQ** *is.* [qədim türkdilli tayfa adından] İndiki aşıq adlandırılan xalq şairi, müğənni və çalğıçının qədim adı.

**VARSAQLAMAQ** *f. qəd.* 1. Şeir oxumaq, şeir demək; deyişmək.

2. *məc.* Boş-boş danışmaq, hərzə danışmaq, çərənçilik etmək.

**VARŞAVYÁNKA** [Varşava şəhərinin adından] XX əsrin əvvəlində rus inqilabçıları arasında geniş yayılmış polyak inqilabi mahnısı.

**VARVARÍZM** [*yun.*] *dilç.* Bir dilin formalarına xas olmayan və həmin dilin təmizliyini pozan xarici söz, ya ifadə.

**VARYAQLAR** *cəm* [*rus.*] *tar.* IX-X əsrlərdə soyğunçuluq və ticarət məqsədi ilə Şərqi və Qərbi Avropaya basqınlar etmiş, habelə qədim Rusiya və Bizansda muzdlu əsgər kimi xidmət etmiş normanlara qədim Rusiyada və Bizansda verilən ad.

**VAR-YOX** *is.* 1. Bir adamın malik olduğu şeylərin hamısı. [Xan:] *Bu gecə nömrədən var-yoxumu aparıb, bircə papağımı qoyublar.* Ə.Haqverdiyev. *..Bu camaatın hər bir fərdi varını-yoxunu sizin sözlərinizin, fikirlərinizin yolların-da fəda etməyə hazırdır.* N.Vəzirov. ☐ **Var-yoxdan çıxmaq, var-yoxu əlindən çıxmaq (getmək)** – əlində olan şeylərin (pulun, mülkün və s.-nin) hamısından məhrum olmaq. *Həştərxanda var-yoxu əlindən çıxdıqdan sonra, Varis korpeşman Bakıya qayıtmışdı.* A.Şaiq. *Səməddən sonra Məstan bəyin də işi çox pis oldu. Var-yoxu əlindən getdi.* B.Talıblı. // Mal və mülk, rifah, nemət. *Ta ki, xəbər gəldi xublar şuxundan; Əl çəkdim cahanın varü yoxundan.* M.V.Vidadi.

2. Vur-tut, ancaq, yalnız, təkcə. *Var-yox bircə oğlu var. – Müsəlman qəzetlərinin yolunda canü dildən çalışan var-yox Ağdaş vilayətində bircə nəfər şəxsdir.* C.Məmmədquluzadə.

**VASİL** [*ər.*]: **vasil etmək** – çatdırmaq, qovuşdurmaq, yetişdirmək, nail etmək. *Müjdə ki, muradım oldu hasil; Məqsudə səni haq etdi vasil.* Füzuli; ☐ **vasil olmaq** – çatmaq, yetişmək, varmaq, qovuşmaq, nail olmaq. *Əzazilin sözün tutma, anın vəsvasına uyma; Ki, iblisə uyan olmaz könül məqsudinə vasil.* Nəsimi. [Qətibə:] *Daha başqaları həqiqətə*

*vasil olmadan bütün sərf edilən təlaşları mənfəətsiz görür.* M.S.Ordubadi. *Bil ki, məqsudə olarsan vasil; Yerdə, göydə, nə isə əlhasil.* A.Səhhət.

**VASİTƏ** *is.* [*ər.*] 1. Bir şeyi əldə etmək, yaxud bir işi həyata keçirmək üçün lazım olan şey, üsul, yol, alət və s. *İstehsal vasitələri. Nəqliyyat vasitələri. Müdafiə vasitələri. Texniki vasitələr. Dil insanların ünsiyyət vasitəsidir. – Mirzə Səfər eşitmişdi ki, şeir yazmaq üçün iki vasitə lazımdır: xəlvət otaq və bir şüşə şərab.* Ə.Haqverdiyev. ☐ **Bu vasitə ilə** – bu yol ilə, bu üsul ilə, bu qayda ilə. *Molla Xəlil axırda bu fikrə gəlmişdi ki, müəllimlə dost olsun. Bu vasitə ilə onu özü üçün zərərsiz bir hala sala bilərdi.* S.Hüseyn.

2. Müalicə və səhiyyə üçün lazım olan şeylər, maddələr; dərman. *Sarğı vasitələri. Dezinfeksiya vasitələri.*

3. İki şəxs və ya tərəf arasında əlaqə düzəldən və ya vasitəçi olan adam; miyançı. [Gülsəba:] *Bir kişi tayfası varmı ki, aralıqda vasitə ola.* M.F.Axundzadə.

**vasitəsilə** *zərf* Bir adamın, yaxud bir şeyin köməyi ilə; hər hansı bir üsul ilə; ...təriqi ilə, ...yolu ilə. *Məsələni müzakirə vasitəsilə həll etmək. Telefon vasitəsilə əlaqə saxlamaq. – Gülpəri bir neçə gün qabaq kağız vasitəsilə yazıb, hansı gün çıxmalarını atasına məlum etmişdi.* S.S.Axundov.

**VASİTƏÇİ** *is.* 1. Bir-biri ilə çəkişən, mübahisə edən iki tərəfi barışdırmağa kömək edən adam və ya təşkilat. // İki tərəf arasında vasitə olan, əlaqə düzəldən şəxs; araçı, miyançı.

2. Ünsiyyət vasitəsi, əlaqə vasitəsi. *Xahiş edərkən həddindən artıq təvazökar və nəzakətli ol, təvazökarlıq xahişin qəbul edilməsi üçün ikinci vasitəçidir.* "Qabusnamə".

**VASİTƏÇİLİK** *is.* Arada vasitə olma; vasitəçi işi; miyançılıq. [Bəxtiyar] *axundun özünə müraciət etməyə, onun vasitəçiliyi ilə inəyini geri almağa qərar verdi.* S.Hüseyn. ☐ **Vasitəçilik etmək** – arada vasitə olmaq. *Mirzə Həbib ağa bir qafqazlıya vasitəçilik etmək fikri ilə rus konsuluna bir məktub yazdırmaq istəmiş.* A.Şaiq.

**VASİTƏLİ** *sif.* Vasitəsi olan; bir vasitə ilə əmələ gələn; birbaşa deyil, vasitə ilə olan.

◊ **Vasitəli vergi** *mal.* – burjua ölkələrində: istehlak şeylərindən alınan vergi. **Vasitəli nitq** – qrammatikada: birisinin eyni ilə deyil, dəyişilmiş şəkildə verilən sözləri. **Vasitəli tamamlıq** – qrammatikada: cümlədə ismin, təsirlik halından başqa, bütün hallarında işlənən söz.

**VASİTƏSİZ** *sif.* Vasitəsi olmayan; doğrudan doğruya olan, arada heç bir vasitə olmayan, bilavasitə.

◊ **Vasitəsiz nitq** – qrammatikada: birisinin olduğu kimi, yəni heç bir dəyişiklik edilmədən verilən sözləri. **Vasitəsiz tamamlıq** – qrammatikada: cümlədə ismin təsirlik halında olan söz.

**VASSÁL** [*fr.*] 1. *tar.* Orta əsrlərdə Qərbi Avropada: özündən daha böyük və güclü olan feodaldan asılı və onun üçün müəyyən mükəlləfiyyətlər görməyə borclu olan feodal.

2. *məc.* İqtisadi və siyasi cəhətdən başqasından asılı olan. *Vassal dövlətlər.*

**VASVASI** *sif.* 1. Hər şeydən çəkinən, hər şeydən iyrənən, hər şeydən şübhələnən. *A qardaş, elə həkimlərin sözünə baxıb bu günə düşmüsən, vasvası olma.* S.S.Axundov. *Bir anda şübhə, heysiyyətimi, qürurumu xırpalayan qara, ağır bir şübhə mənim vasvası qəlbimdə kök saldı.* Ə.Məmmədxanlı.

2. *dan.* Səliqədə ifrata varan, son dərəcə xırdaçı. *Vasvası adam.*

**VASVASILIQ** *is.* Vasvası adamın xasiyyəti, halı. [Qəmər:] *Yox, siz qoca deyilsiniz ki. Mənə elə gəlir ki, sizin əsas xəstəliyiniz vasvasılıqdır.* S.Rəhman.

**VAŞAQ** *is. zool.* Pişiklər fəsilə-sindən çox itigözlü yırtıcı heyvan. *Vaşaq dərisi.*

**VATERPÁS** [*holl.*] *tex.* Xəttin, müstəvinin üfüqi vəziyyətini yoxlamaq üçün cihaz.

**VATERPÓL(O)** [*ing.*] *idm.* İki üzgüçü komandası arasında suda oynanılan top oyunu. *Vaterpolo yarışları.*

**VATERPÓL(O)ÇU** *is. idm.* Vaterpol(o) oyunçusu olan idmançı. *Yarışlarda futbolçulardan başqa, vaterpolçular, həndbolçular və başqaları da iştirak edəcəklər.*

**VATÍN** [*fr.*] İstilik üçün paltarın üzü ilə astarı arasına tikilən çox qalın xovlu seyrək trikotaj parça.

**VATİNLİ** *sif.* Vatin tikilmiş, vatini olan. *Vatinli palto.*

**VÁTMAN** [*xüs. is.-dən*]: **vatman kağızı**: rəsmxətt və rəsm üçün əla möhkəm kağız növü.

**VATT** [fizik C.Uattın (1763-1819) adından] *fiz*. Elektrik cərəyanı qüvvəsini ölçmə vahidi.

**VATTMÉTR** *fiz*. Elektrik qüvvəsini vattlarla ölçmək üçün cihaz. *Vattmetr qazıma mühərrikinin* [elektromotorun] *sərf etdiyi gücü qeyd edir.* Quliyev.

**VAV** Ərəb əlifbasında " و " yazılan hərfin adı.

**VAVEYLA** *is.* [*ər.*] Vay, dad, fəryad, fəğan. *Vaveyla qoparmaq*. – [Əbülhəsən bəy:] *Biz Təbriz küçələrində qopan bu vaveylanın təzə bir macəra olduğuna inanırdıq.* M.S.Ordubadi. *Şapkalı zabitlərin ağır addımları döşəmədə fəlakət kimi səslənəndə evdə vaveyla ucaldı.* Mir Cəlal.

**VAY** 1. *nida*. Qorxu, həyəcan, təəssüf, kədər, ağrı, təəccüb, fərəh kimi hissləri ifadə edir. *Vay, yazıq! Vay, ilana bax! – Vay, kim, əğyar ilən ol yar həmdəmdir yenə*. Kişvəri. [Ziba xanım:] *Vay, yad kişinin səsi gəlir; vay, indicə qapıdan girəcəkdir.* M.F.Axundzadə. // Yenə yuxarıdakı mənalarda olaraq, müxtəlif tərkiblər daxilində işlənir. *Vay, dədəm, vay! Vay, mənim başım! Vay, mənim günümə!* – [Şölə xanım:] *Vay, dədəm vay, nənəm vay! Amandır, Teymur ağa, pərdənin dalısında gizlən.* M.F.Axundzadə. *Amma vay bizim arvadlarımızın gününə, şah Təhmasın vaxtında geyilən paltarı indi də geyirlər.* H.Zərdabi. // Bəzən təkrar şəklində işlənir: vay-vay, vay-vay-vay. *Qorxuram Zakiri hicrin qəmi bir halə sala; Görən adəm deyə vay-vay, budu divanə gəlir.* Q.Zakir. *Vay-vay, nə yaman müşkülə düşdü işim, Allah!* M.Ə.Sabir. [Arvad:] *Vay-vay-vay! A kişi, bu nə üst-başdır, bu nə əl-ayaqdır, əşi, qoşunkeşdidən, davadan gəlirsən nədir?* H.Sarabski. ◻ **Vay salmaq, vay-şivən salmaq (qoparmaq)** – qışqırıq salmaq, çığırmaq, fəryad etmək, şivən qoparmaq. *Cənnət xanım dizlərinə çırpıb vay-şivən saldı.* Mir Cəlal. **Vayını vermək** – cəzalandırmaq, döymək, əzişdirmək və s. [Güldəstə:] *Sən neçin qaçırsan, .. axtarar, tapar, vayını verər.* N.Vəzirov.

2. *is.* Yas, ölü yeri, yaxud müsibət, bədbəxtlik mənasında. *Öldür Ələsgəri qurtulsun canı; Vay xəbərin göndər qohum-qardaşa.* Aşıq Ələsgər. *Vayımı yar eşidib, vay, könül, söylədi kim; Seyyidim çoxdan ölübdür, bu onun vayı deyil.* S.Ə.Şirvani. [Vaqif:] *Bizdə hər gün bir təzə xəbər var: ya toydur, ya vay, ortası yoxdur*. Çəmənzəminli.

**VAYXIR** *sif.* 1. Huşsuz, fərsiz.

2. Mineral su adı.

**VAYILDAMA** "Vayıldamaq"dan *f.is.*

**VAYILDAMAQ** *f.* Vay demək, inildəmək, zarımaq, ax-vay etmək. *Alo zarıyan yasavulu dümsüklədi: – Əyə, balam, niyə vayıldayırsan, arvad deyilsən ki?!* S.Rəhimov.

**VAYILDAŞMA** "Vayıldaşmaq"dan *f.is.*

**VAYILDAŞMAQ** *qarş. dan*. Birlikdə vayıldamaq (bir neçə adam).

**VAYILTI** *is.* Vay səsi, ax-uf səsi, inilti səsi.

**VAYQANLI** *sif. dan*. Əsassız olaraq adı pisliyə çıxmış (adətən "adı vayqanlı" şəkildə işlənir). *Heç kəsin adı vayqanlı olmasın.* (Ata. sözü).

**VAYLI** *sif.* Fəlakətli, həyəcanlı, təlaşlı. *Axşam çökdü şəhərə, bir südlü, aylı axşam; Çoxlu xəbər gətirdi; şivənli, vaylı axşam.* Ə.Cavad.

**VAYSILANMAQ** b a x **vaysınmaq**. [İlyas] *təzə köynəyini geyib, güzgünün önündə dayananda, üzünü saqqal basdığını görüb vaysılandı.* Mir Cəlal.

**VAYSINMA** "Vaysınmaq"dan *f.is.*

**VAYSINMAQ** *f. dan.* Heyifsilənmək, ax-vay etmək, çox təəssüf etmək. *Nəbi yoldaşı Mahmudun ölməsi üçün çox vaysılanırdı.* "Qaçaq Nəbi". [Tubu:] *Gedirsən, get. Sonra vaysınanda danışaram*. Ə.Haqverdiyev.

**VAZ¹** *is.* Baramaçılıqda: kələfcə şəklində sarınan incə yalınqat ipək teli.

**VAZ²: vaz keçmək** – əl çəkmək, fikrindən daşınmaq. *Öz fikrindən, niyyətindən vaz keçmək. – Axırda mülahizələr yürütməkdən vaz keçərək sükuta daldım.* Çəmənzəminli. [Sərdar Rəşid:] *Təbiidir ki, mən sizin şərəfinizə toxunmamaq üçün ona cəza verməkdən vaz keçirəm.* M.S.Ordubadi. *Hətta qurdu nişan alıb vurmaq istədim. Nədənsə fikrimdən vaz keçdim.* A.Şaiq.

**VAZ³: vaz atmaq** – hoppanmaq, sıçramaq, atılmaq, atılıb-düşmək. *Sürü üstündə çobanlar yatmaz qorxudan; Çöldə heyvan ya maral vaz atmaz qorxudan.* A.Səhhət. *Budur,*

*qız, getsənə, ilk qatar gəlir; Ürkərək vaz atıb qaçır dəvələr*. S.Rüstəm. *Dovşanlar çalın-çarpaz yolla qaçaraq, tazıları çaşdırır, arabir də vaz atardılar*. H.Sarabski.

**VÁZA** [*fr.*] İçinə meyvə, şirniyyat, çiçək və s. qoymaq, yaxud bəzək üçün qəşəng qab. *Gülməyir vazamda artıq gül, çiçək; Məni düşündürür indi hər sözün.* S.Rüstəm. [Hüseyn və Mirmahmud] *uzun büllur vazalardakı mürəbbədən, qənddən çaya saldılar, qaletdən yeyib, çaydan içdilər.* S.Rəhman.

**VAZEH** *sif.* və *zərf* [*ər.*] Aşkar, açıq-aydın, şübhəsiz. [Səkinə xanım:] *Nə danışırsan, vazeh danış, görüm mətləbin nədir?* M.F.Axundzadə. *Hicran qəminin badeyi-gülgundür əlacı; Vazeh danışırlar bunu meyxanələr içrə.* Q.Zakir. *Üçüncü sual: göydə ulduz çoxdur, ya müsəlman bazarında qumarxana? Bu da vazehdir*. C.Məmmədquluzadə.

**VAZEHLİK** *is.* Aşkarlıq, açıqlıq, aydınlıq.

**VAZELÍN** [*fr.*] Neftdən istehsal edilən, ətriyyat və texnikada işlənən yağlı maddə.

**VAZELİNLƏMƏ** "Vazelinləmək"dən *f.is.*

**VAZELİNLƏMƏK** *f.* Vazelin sürtmək.

**VAZELİNLƏNMƏ** "Vazelinlənmək"dən *f.is.*

**VAZELİNLƏNMƏK** *məch.* Vazelin sürtülmək.

**VAZELİNLİ** *sif.* 1. Tərkibində vazelin olan. *Vazelinli sabun*.

2. Vazelin sürtülmüş.

**VAZIMAQ** *f. məh.* Qaçmaq. [Rüstəm bəy:] *Əliqılınclı, qabağımdan dovşan tazı qabağından qaçan kimi vazıyırdı*. N.Vəzirov.

**VAZLAMAQ** b a x **vaz atmaq** ("**vaz**[3]"da). *Ceyran yana sıçradı, buynuzlarını boynuna qısıb daha da bərk vazladı*. M.Rzaquluzadə.

**VE** "V" hərfinin və bu hərflə işarə olunan samitinin səssizin adı.

**VEC** Adətən feillərlə işlənir: **vecə gəlmək** – lazım olmaq, gərək olmaq, yararlıq göstərmək, yaramaq. [Bəylərdən birisi:] *Həkim tayfasının ehtiramı vacibdir, xalqın vecinə gəlirlər.* M.F.Axundzadə. [Bəbir bəy:] *Ancaq ki özün yovuşan adam deyilsən, .. vecə gələn deyilsən, üzünə deyirəm.* Mir Cəlal; // hörməti olmaq, əhəmiyyəti, dəyəri olmaq. *Puç olsun qocalıq, gördün ki, necə; Bir pulca xublara gəlməzmiş vecə.* M.V.Vidadi; **vecinə almaq** – saymaq, etina etmək, əhəmiyyət vermək, hesablaşmaq. *Bizim Həzi də belə şeyi vecinə alan deyil.* S.Rəhimov; **vecinə almamaq** – saymamaq, etina etməmək; mütəəssir olmamaq. *Kəndin uşaqları bu dəhşətli gurultunu heç vecinə də almırdılar.* P.Makulu; **vecinə gəlməmək** – b a x **vecinə almamaq**. *Bu hal Rəfizadənin vecinə gəlmirdi.* M.S.Ordubadi. *Fəqət ofiser görərdi ki, dava yaman qızışıb, bunların heç birinin vecinə gəlmir. Əmr elərdi ki, vuruşanları gülləyə bassınlar*. H.Sarabski; **nə vecimə (vecinə)** – bir şeyə, bir hadisəyə qarşı laqeydliyi ifadə edir – nə işimə (nə işinə), nə borcuma (nə borcuna). [Sona xanım:] *A kişi, mənim nə vecimə ki, rus firəng malını qadağan edibdir*. M.F.Axundzadə. *A qardaşlar, axır bir deyiniz görüm, mənim nə vecimə ki, səhərlər saat altıda kontora gəlib, axşam saat onda azad olursunuz*. C.Məmmədquluzadə.

**VECSİZ** *sif.* Lazımsız, gərəksiz, yararsız, karsız, yaramaz, dəyərsiz, xeyirsiz, işəgəlməz, bikara. *Səndə bitər bir neçə vecsiz qoza; Ancaq o da qismət olar donquza.* M.Ə.Sabir. *Mən hərdən oturub fikirləşirəm və bu əqidəyə gəlirəm ki, bizim çoxumuzu bədbəxt edən karsız, vecsiz və xeyirsiz qohumlarımızdır.* Ə.Vəliyev. // Mənasız. *Nə qədəri vecsiz kəlam söyləsə; Ağzından cavahir saçdı, deyərlər.* Aşıq Kamal.

**VECSİZLİK** *is.* Yararsızlıq, yaramazlıq, dəyərsizlik, faydasızlıq, karsızlıq, heç bir şeyə lazım olmama. [Salavat] *əlinə keçirdiyi düşmənin belə vecsizliyindən pərt olub, narazılıqla mırıldandı*. Ə.Əbülhəsən. // Mənasızlıq.

**VÉÇE** *is.* [*rus.*] Qədim və orta əsr rus şəhərlərində xalq yığıncağı.

**VEDA** [*sanskr.*] Hindistanın dini.

**VEDALAR** *cəm* Qədim Hindistanın dörd müqəddəs kitabı.

**VEDRƏ** *is.* [*rus.* ведро] Su və başqa mayeləri daşımaq və saxlamaq üçün silindrşəkilli qab; böyük satıl. *Uşaqlar itin quyruğuna vedrə bağlayıb qovurlar*. Ə.Haqverdiyev.

◊ **Vedrə bağlamaq** *dan.* – ələ salmaq, araya qoymaq, lağa qoymaq, masqara etmək, dolamaq.

**VEDRƏCİK** *is.* Kiçik vedrə.

**VEDRƏLƏMƏ** *dan.* "Vedrələmək"dən *f.is.*

**VEDRƏLƏMƏK** *f. dan.* bax **vedrə bağlamaq** (“**vedrə**”də).

**VEGETARİAN** *is.* [*ing.*] Yalnız bitki yeməkləri ilə qidalanan adam.

**VEGETÁSİYA** [*lat.*] Bitkinin cücərməsi, boy atması və inkişaf dövrü. *Çay bitkisinin vegetasiya dövründə istiyə çox ehtiyacı vardır.*

**VEGETATİ́V** *sif. bot. zool.* Canlı orqanizmlərin inkişaf və qidasına aid olan. *Çay bitkisinin vegetativ üsulla artırılması seleksiya-toxumçuluq işində geniş tətbiq edilir.* ☐ **Vegetativ çoxalma** *bot.* – bitkilərin qeyri-cinsi çoxalması üsulu. **Vegetativ sinir sistemi** *anat.* – sinir sisteminin orqanizmdə tənəffüs, həzm, qan dövranı, ifrazat və maddələr mübadiləsi proseslərini idarə edən hissəsi. **Vegetativ nevroz** *tib.* – vegetativ sinir sisteminin funksional pozulması.

**VÉKSEL** [*alm.*] Bir şəxsə və ya idarəyə müəyyən müddətdə, müəyyən miqdarda pul verməli olan şəxs tərəfindən verilən iltizamnamə. [Dükançı:] *A kişi, yaxşı yadıma düşdü, Hacı İmamqulunun vekselinin vaxtıdır, aparım onun pulunu verim.* Ə.Haqverdiyev. *Qulu o gün veksel ilə min manat alıb Yunus bəyin yanına getdi.* A.Şaiq. [Bəhram:] *Belə məlumdur ki, veksel fəqərəsi doğru imiş.* C.Cabbarlı.

**VÉKTOR** [*lat.*] *riyaz.* Ədədi qiyməti və istiqaməti olan riyazi kəmiyyət və bu kəmiyyətin qrafik təsviri.

**VEKTORİÁL** *sif.* Vektora aid olan. *Bektorial hesablama. Vektorial kəmiyyət.*

**VELİKORÚS** bax **rus**.

**VELODRÓM** [*fr.* velo və *yun.* drom] Velosipedləri sınamaq və velosiped yarışları keçirmək üçün xüsusi meydan, betonlu yol.

**VELOSİPÉD** [*lat.*] Ayaqlarla hərəkətə gətirilən ikitəkərli, yaxud üçtəkərli minik maşını. *Velosiped yarışı. Uşaq velosipedi.*

**VELOSİPEDÇİ** *is.* Velosiped sürən adam, velosipeddə gəzən, yaxud velosiped ilə məşğul olan adam. *Velosipedçilərin yarışı.*

**VELǗR** [*fr.*] 1. *toxuc.* Drapın, məxmərin ən yaxşı növlərinin adı. *Velür şlyapa. Velür palto. Qoyun, yunundan, xüsusilə zərif və yarımzərif yundan ən qiymətli parçalar – baston, triko, velür və başqaları hasil olur.*

2. Zamşaya (üzüxovlu dəriyə) oxşayan dəri növü.

**VELVÉT** *is.* [*ing.*] Nazik iplikdən toxunmuş qabarıq milləri olan parça.

**VÉNA** [*lat.*] *anat.* Qanı ürəyə aparan qan damarı.

**VENÉRA**[1] *is.* [*lat.*] Qədim yunan mifologiyasında məhəbbət və gözəllik ilahəsi.

**VENÉRA**[2] *is.* [*lat.*] Günəş sistemində Günəşə yaxınlığına görə ikinci planet.

**VENEROLÓGİYA** [*yun.*] *tib.* Tibb elminin zöhrəvi xəstəliklər bəhsi.

**VENEROLOJİ́** *sif.* Venerologiyaya aid olan. *Veneroloji dispanser.*

**VENERÓLOQ** [*yun.*] *tib.* Zöhrəvi xəstəliklər mütəxəssisi; həkim.

**VENET(LƏR)** *is.* [*lat.*] Qədimdə Adriatik dənizinin şimal sahillərində yaşamış tayfalar qrupu.

**VENÓZ** *sif. anat.* Venalara aid olan, yaxud venaların içində olan.

**VÉNTİL** [*alm.*] *tex.* Borularda, cihazlarda və s.-də mayenin, qazın, yaxud buxarın yolunu açıb-bağlamaq üçün qurğu, qapaq.

**VENTİLYÁSİYA** [*lat.*] 1. Qapalı binalarda və s.-də havanın dəyişdirilməsi və təmiz hava ilə əvəz edilməsi. *Bu otağın ventilyasiyası pisdir.*

2. Qapalı yerlərin havasını dəyişdirmək və təmizləmək üçün cihazlar və ya qurğular sistemi.

**VENTİLYÁTOR** [*lat.*] Qapalı binalarda, yeraltı qazmalarda və s.-də havanı dəyişdirmək, təmizləmək, yaxud onun cərəyanını gücləndirmək üçün cihaz, qurğu. *Elektrik ventilyator. Sorucu ventilyator.*

**VER-AL** *is.* Alver, alış-veriş. *Bu ramazanlıqda nə ver-aldı bu? Ax! Nə qəzetdi bu, nə jurnaldı bu?* Ə.Nəzmi.

**VERÁNDA** [*port.*] Binanın yanında: qabaq tərəfi açıq və ya şüşələnmiş üstüörtülü balkon, artırma, eyvan. *Qəmər verandanı səliqəyə saldıqca mahnının sözlərini təkrar edir.* S.Rəhman.

**VERBAL** *sif.* [*lat.*] Şifahi, imzasız.

**VERDİRMƏ** “Verdirmək”dən *f.is.*

**VERDİRMƏK** *icb.* Verməyə məcbur etmək.

**VERDİRTMƏK** *icb.* Başqa bir şəxs vasitəsilə birisini bir şey verməyə məcbur etmək.

**VERƏCƏK** *is.* Gələcəkdə verilməsi lazım olan şey; borc (*alacaq* müqabili). *Alacağın olsun, verəcəyin olmasın.* (Ata. sözü).

**VERƏCƏKLİ** *sif.* Birinə verəcəyi (borcu) olan; borclu.

**VERF** [*holl.*] Gəmi düzəldilən və təmir edilən yer. *Sovxoz və gəmi inşa edən verf ilə tanış olduq.* Ə.Məmmədxanlı.

**VERGİ** *is.* 1. Müəssisədən, idarədən, əhalidən və s.-dən alınan məcburi dövlət rüsumu. *Gəlir vergisi. Kənd təsərrüfatı vergisi. Vergi qoymaq.* // Töycü. *Ərəb əmiri Əbu Müslim bütün Dağıstan əhalisi üzərinə vergi təyin edib buyurdu ki, .. onu gətirib Dərbənd hakiminə versinlər.* A.Bakıxanov.

2. *məc.* Fövqəladə istedad, qabiliyyət. *O səsin, o verginin sahibi Şamaxı meşəsində çır-çırpı yığır.* Mir Cəlal.

**VERGİÇİ** *is.* Vergi verən.

**VERGİYIĞAN** *is.* Vergi yığmaqla məşğul olan işçi.

**VERGÜL** [*fr.*] *dilç.* Sözləri, söz qruplarını, yaxud cümlələri ayıran qarmaqşəkilli durğu işarəsi (,). *Vergül qoymaq. Nöqtəli vergül* (;).

**VERİCİ** *sif. rad.* Radio dalğalarını (elektromaqnit dalğalarını) fəzaya buraxan. *Verici stansiya hər tərəfə radio dalğaları buraxır.*

**VERİLİŞ** "Verilmək"dən *f.is. Elektrik verilişi sistemləri. Televiziya, radio verilişi.*

**VERİLMƏ** "Verilmək"dən *f.is.*

**VERİLMƏK** "Vermək"dən *məch. Əldən-ələ verilmək. Klub üçün yaxşı bina verilmişdir. Maaş sabah veriləcəkdir. – Üçüncü siqnal veriləndə Ehtiyat xalanın qəlbi tərpəndi.* Mir Cəlal.

**VERİM** *is.* Məhsul vermə qabiliyyəti; bərəkət, məhsul, səmərə. *Bu inəyin verimi yaxşıdır.*

**VERİMCİL** *sif.* 1. Bol məhsul verən, məhsuldar, bərəkətli. *Verimcil inək. Verimcil ağac.*

2. *məc.* Əliaçıq, səxavətli.

**VERİMLİ** b a x **verimcil**. *Verimli torpağı, geniş çölləri; .. Keçidləri, rizləri var ölkəmin.* C.Cabbarlı.

**VERİMLİLİK** *is.* Məhsuldarlıq, bərəkətlilik, münbitlik. *Torpağın verimliliyi.*

**VERİMSİZ** *sif.* Məhsul verməyən, bərəkətsiz.

**VERİŞ** b a x **vermə**.

**VERİZM** *is.* [*ital.*] XIX əsrin sonunda italyan ədəbiyyatında, musiqisində və təsviri sənətində realist cərəyan.

**VERMƏ** "Vermək"dən *f.is. Qiymət vermə. Ara vermə.*

**VERMƏK** *f.* 1. Bir şeyi öz əlindən çıxarıb başqasına ötürmək, təslim etmək, çatdırmaq; tapşırmaq. *Pul vermək. Onu mənə ver. Hazır materialları redaktora verdim. Əldən-ələ vermək. – Feldşerin verdiyi təmiz xalat ona çox gözəl yaraşırdı.* M.Hüseyn.

2. İstifadə üçün ayırıb birinin sərəncamına tapşırmaq, ixtiyarına vermək. *Klub üçün bina vermək. Yeni binada ona üçotaqlı mənzil verdilər.*

3. Bağışlamaq, hədiyyə etmək, mükafatlandırmaq. *Mükafat vermək. Pay vermək.*

4. Sərf etmək, yönəltmək, sövq etmək. *Bütün fikrini işə vermək.*

5. Ödəmək, əta etmək, qaytarmaq. *Aldığı şeyin pulunu vermək. Haqqını vermək. Borcunu vermək istəmir.*

6. Pulla ödəmək, müəyyən qiymətə almaq. *Paltoya yüz manat vermişəm. Kitaba nə verdin?*

7. Hasil etmək, hüsula gətirmək. *Qazanc vermək. Bar vermək. Müəssisə çoxlu gəlir verir. Ağac çoxlu meyvə verir. Bu quyu daha neft vermir.*

8. Düzəltmək, təşkil etmək, tərtib etmək. *Ziyafət vermək. Tamaşa vermək. Konsert vermək.*

9. Nəşr etmək, elan etmək. *Qəzetdə elan vermək. Qanun vermək.*

10. Bildirmək, demək. *Telefonunun nömrəsini vermək. Ünvan vermək.*

11. Yaşını təyin etmək (üzdən, zahirdən). *Ona 40 yaşdan artıq vermək olmaz.*

12. Tapşırmaq, təyin etmək, həvalə etmək. *Şagirdə məsələ vermək. Çətin iş vermək.*

13. Ərə getməsinə icazə vermək, yaxud məcbur etmək. *Qızı oğlana verdilər. Atası qızını verməkdən boyun qaçırdı.* // Qovuşmasına, birləşməsinə imkan vermək. *Vermədi Fərhadə çərxi-bivəfa Şirinini, Hadiya.* M.Hadi.

14. "Özünü" sözü ilə bərabər – getmək, yönəlmək, bir tərəfə üz tutmaq. *Özünü bulvara verdi.* – [Salmanov:] *Danışma, özünü*

*ver dağ yoluna, ayrı əlac yoxdur.* S.Rəhman. // Gizlənmək mənasında. *Özünü ağacın dalına verdi* (*ağacın dalında gizləndi*).

15. Bir sıra isimlərlə birləşdirilərək, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: cavab vermək, əmr vermək, icazə vermək, yol vermək, ad vermək, can vermək.

**VERMİŞÉL** [*ital.*] Fabrikdə hazırlanan girdə əriştə növü.

**VERMİŞELLİ** *sif.* Vermişeldən hazırlanmış, içərisində vermişel olan. *Vermişelli şorba.*

**VERONAL** *is.* [*lat.*] *tib.* Yuxu dərmanı.

**VERSİYA** *is.* [*lat.*] 1. Rəvayət, şayiə, xəbər.

2. Eyni faktın və ya hadisənin bir-birindən fərqli bir neçə cür izahı.

**VERST** [*rus.* верст**á**] *köhn.* 1,06 kilometrə bərabər rus uzunluq ölçüsü (metr üsuluna keçməzdən əvvəl işlənirdi). [Faytonçu] *bu sürətlə təxminən iki verst gedəndən sonra, atların cilovunu çəkdi.* Ə.Haqverdiyev. ☐ **Verst ağacı** *köhn.* – yolların kənarında: yolun hər bir verst məsafəsini göstərən dirək. *Fəqət hərdən baxar ikən uzun, uzaq çöllərə; Alaca verst ağacları gəlir ancaq nəzərə.* A.Səhhət. **Bir verstdən** – uzaqdan, çox uzaqdan. *Onun gözü bir verstdən görür.*

**VERSTÁTKA** [*rus.*] *köhn.* Əl ilə hərfləri yığmaq üçün mətbəə aləti. *O kiçik bir verstatkanın ağacı üzərində yarımçıq qalmış naboru götürüb, sürətlə yığmağa başladı.* S.Rəhman.

**VERSTLİK** *sif.* Saylarla işlənərək, məsafənin neçə verst uzunluğunda olduğunu göstərir. *Qala şəhərin qırx verstliyində idi. – Suraxanıdan Mərdəkan bağlarınadək 17-18 verstlik bir məsafəni piyada getmək mənim üçün çətin idi.* S.Hüseyn.

**VERŞÓK** [*rus.*] *köhn.* Arşının $^1/_{16}$ hissəsinə – 4,4 sm-ə bərabər köhnə rus uzunluq ölçüsü. *..Bu sünbə nəinki tamam arşındır, hətta arşından iki verşok da azdır.* Ə.Haqverdiyev. [Cəmil:] *Bir də görürsən balta fırlanır, amma heç bir verşok da dərinə getmir.* M.Hüseyn.

**VERTİKÁL** *sif.* Şaquli. *Vertikal xətt. Vertikal vəziyyətdə.*

**VERTİKALLIQ** *is.* Şaqulilik; şaquli şeyin halı.

**VERTOLYÓT** [*rus.*] Şaquli xətt üzrə qalxıb enə bilən, həmçinin havada sallana bilən xüsusi quruluşlu təyyarə. *Şəhər ilə Sumqayıt və "Neft daşları" arasında vertolyot işləyir.*

**VESTERN** *sif.* [*ing.*] Qərbə məxsus olan, qərbə aid olan.

**VESTİBÚL** [*fr.*] Adətən ictimai binaların daxili girəcəyində böyük dəhliz, geniş eyvan. *Teatrın vestibülü.*

**VETERÁN** [*lat.*] 1. Müharibə iştirakçısı olan qocaman döyüşçü. *Böyük Vətən müharibəsi veteranları ilə görüş.*

2. Hər hansı bir sahənin köhnə, əməkdar işçisi, xadimi. *Elm veteranları. Səhnə veteranı.*

**VÉTO** [*lat.*] Qadağan etmə, ləğv etmə: a) dövlət hüququnda: bir dövlət orqanının başqa bir orqanın qərarının həyata keçirilməsini qəti və ya şərti qadağan etməsi; b) beynəlxalq hüquqda: məsələlər yalnız bir səslə həll edilən beynəlxalq təşkilatlarda üzvlərdən birinin, əksəriyyətin çıxardığı qərarın qəbul edilməsinə mane olan etirazı.

**VEYİL** *sif.* Avara, boş-boşuna gəzən, heç bir iş sahibi olmayan. *Veyil adam.* // İs. mənasında. [Nabat:] *Sən elə veylin üstündə öz əmini niyə belə ağrıdırsan?* S.Rəhimov.

**veyil-veyil** *zərf* Avara-avara, boş-boşuna, heç bir işdən yapışmayaraq, boş-bikar. *Veyil-veyil gəzmək.* – [Kərim babanın] *o qapı-bu qapıda veyil-veyil sürünməkdən başqa əlindən bir iş gəlməzdi.* A.Şaiq.

**VEYİLLƏNMƏ** "Veyillənmək"dən *f.is.*

**VEYİLLƏNMƏK** *f.* Heç bir iş görməyərək boş-boş, avara-avara gəzmək. *Bu Allahın bəlasına giriftar olmuş da yaylaqlarda veyillənməkdən yorulmadı.* C.Məmmədquluzadə. *Küçə-bacada veyillənməkdənsə, uşaqlar qoy şəhərin tarixi yerlərini gəzsinlər, öyrənsinlər.* Ə.Əbülhəsən.

**VEYİLLƏŞMƏ** "Veyilləşmək"dən *f.is.*

**VEYİLLƏŞMƏK** *f.* Veyil olmaq, avara olub getmək, tənbəlləşmək.

**VEYİLLİK** *is.* Heç bir işdən yapışmayaraq boş-boş gəzmə; avaralıq, bikarlıq.

**VEZİKUL** *is.* [*lat.*] *tib.* Dəridə qabarcıq, suluqlar, səpgi.

**VƏ** *bağl.* Sadə cümlələrdə həmcins üzvləri, mürəkkəb cümlələrdə isə onun tərkibinə daxil olan cümlələri bir-birinə bağlayır. [Qız]

*aslan və qəhrəman olsa da, vəhşət önündə acizdir.* Mir Cəlal. // İki sözü bir-birinə bağlayaraq, onlara birləşdirici məna, yaxud ümumi məfhum verir. *Mən və sən.* "*Qılınc və qələm*". *Ar və namus. Dəftər və qələm. Böyüklər və kiçiklər.*

**VƏBA** *is.* [*ər.*] *tib.* Çox yoluxucu ağır bir xəstəlik; ovma. *Bunlardan da əlavə, Rəşt şəhərində tif və vəba xəstəliyi şiddətli surətdə yayılırdı.* M.S.Ordubadi.

**VƏBAL** *is.* [*ər.*] *köhn.* Günah, məsuliyyət; babal. [Şəhrəbanı xanım:] *Bunun vəbalı olsun Parij qızlarının, gəlinlərinin boynuna ki, .. xalqı azdırıb yoldan çıxardırlar.* M.F.Axundzadə. *Vəbalı nağıl edənin boynuna, yalan-doğruluğuna zəmanət etmirəm.* Ə.Haqverdiyev.

**VƏBALI** *sif. tib.* Vəba xəstəliyinə tutulmuş. *Vəbalı xəstələr.*

**VƏCAHƏT** *is.* [*ər.*] Gözəllik, qəşənglik, göyçəklik, yaraşıq; gözəl üz. *Nəçidir ay vəcahətdə ola tay sənə.* Q.Zakir. *Səndə, ey ləli şəkər bunca vəcahət qalmaz.* S.Ə.Şirvani.

**VƏCAHƏTLİ** *sif.* Üzü gözəl, qəşəng, göyçək.

**VƏCD** *is.* [*ər.*] Həddən artıq sevinc, şadlıq, ruh yüksəkliyi; hədsiz şövq və həvəs. *Sevincimin, vəcdimin çoxluğundan durub oynamaq istəyirdim.* M.F.Axundzadə. *Salman* "*Kapital*"*ı əlinə alıb vəcdlə* (z.): *– Bu kitab köhnə aləmi tamamilə yıxacaq, – dedi, – daşı daş üstə qoymayacaq.* Çəmənzəminli. // Özünü itirmək dərəcəsində dalğınlıq. *Şair bu sözləri vəcd halında söyləyərək, bihuşanə yıxılıb hərəkətsiz qalır.* A.Səhhət. ☐ **Vəcd etmək** – b a x **vəcdə gəlmək**. [Xacə Mübarək:] *Şahın övrəti və qızları göndərilən töhfələrdən qayətdə vəcd etdilər.* M.F.Axundzadə. **Vəcdə gəlmək** – son dərəcə sevinmək, şadlanmaq, şövqə gəlmək, ruhlanmaq. *Bağladım vəcdə gəlib hüsnünə şerimlə kitab.* S.Rüstəm. *Hamı vəcdə gəlir .. bu məsləhəti; Bəyənib dəyişir aşıq söhbəti.* O.Sarıvəlli. **Vəcdə gətirmək** – cuşa gətirmək, ruhlandırmaq. *Bu sözlər qocanı vəcdə gətirdi.* İ.Əfəndiyev. *Tapdığın iri, qüvvətli görkəmi isə topçuları vəcdə gətirdi.* Ə.Əbülhəsən.

**VƏCDLİ** *sif.* Vəcdə gəlmiş, cuşa gəlmiş, ruhlanmış, şad, sevincli.

**VƏCH** *is.* [*ər.*] 1. *klas.* Üz, sifət, çöhrə, surət. *Leyk hanı səndə bəsirət gözü; Ta görəsən vəchi-dilarasını.* M.Ə.Sabir.

2. Yol, üsul, vasitə, tərz, qayda (adətən "ilə" qoşması, yaxud "lə" şəkilçisi ilə işlənir). *Əvvəl zaman kürreyi-ərzin qabığı qayət nazik olub, ona görə bu vəchlə vücuda gələn çatlaqların da ədədi artıq olmuşdur.* H.Zərdabi. *Elə asan vəchlə başa düşdülər ki, dəxi bu dildən başqa qeyri bir dil axtarmağa hacət qalmadı.* C.Məmmədquluzadə. ☐ **Heç (bir) vəchlə** – heç bir surətlə, heç bir yolla, qətiyyən, əsla. *Uşaq heç vəchlə bədbəxt anası Zeynəbin səfərə getməsinə inanmayırdı.* M.S.Ordubadi. *Qaraca qız bu zülmdən xilas olmaq üçün neçə dəfə qaçmaq fikrinə düşmüşdüsə də, lakin qaçmağa heç bir vəchlə imkan tapa bilməmişdi.* S.S.Axundov. [Səriyyə xala] *alt köynəyinin yaxasında gizlətdiyi 30 tümən pulu heç bir vəchlə xərcləmək istəmir*(*di*).. M.İbrahimov. **Hər vəchlə** – hər bir vasitə ilə, hər necə olur olsun. *Axır günlər tez-tez Gülüşlə görüşməyə can atan Günəş hər vəchlə Gülüşdən söz almaq istəmişdisə də, müvəffəq ola bilməmişdi.* Ə.Vəliyev.

3. *klas.* Səbəb, vəsilə, cəhət, münasibət. *Dəmbədəm gər düşsə gözdən dürri-əşkim vəchi var.* Füzuli. *Göstərsə yarə könlünü var vəchi Seyyidin; Öz xaneyi-xərabını memara göstərir.* S.Ə.Şirvani. *Kəndli dedi: – Vəchi budur, müxtəsər; Səndə o şeydən əbədən yox əsər.* A.Səhhət. ☐ **Nə vəch ilə** – nə səbəbə, nə üçün, niyə. *Nə vəch ilə tutub xət səfheyi-rüxsarın ol şuxun?* Q.Zakir.

**VƏCİHƏ** *sif.* [*ər.*] Gözəl, qəşəng, göyçək. *Şəhər əhalisindən Nəbi İsmayılov adlı bir şəxsin bir vəcihə qızı var idi.* Ə.Haqverdiyev. [Abtalıb:] *Ay arvad, o qızın barəsində mən də eşitmişəm, deyirlər çox vəcihədir.* H.Sarabski.

**VƏD** *is.* [*ər.*] Bir işi yerinə yetirmək üçün qabaqcadan söz vermə, öhdəyə götürmə. [Molla İbrahim Xəlil:] *..İyirmi put, onu da yəhudilər aparsınlar ki, mənim vədim xilaf olmasın.* M.F.Axundzadə. ☐ **Vəd etmək** – bir işi edəcəyinə söz vermək, öhdəsinə götürmək. [Şəmsiyyə: ] *Vəd edin ki, dostluğumuz əbədi olaraq qalacaqdır.* M.İbrahimov. *Salman kişi* [Aqilə] *çoxlu dəftər, rəngli qələm alacağını vəd etdi.* Mir Cəlal. **Vədinə xilaf çıxmaq** – verdiyi sözü yerinə yetirməmək.

*Lətifə yenə gözlərini qaldırmadan cavab verdi: – Bəli, usta! Qoy vədinə xilaf çıxan utansın*. M.Hüseyn.

**VƏDƏ** *is.* [*ər.*] 1. Bir iş üçün qabaqcadan təyin olunan vaxt, müddət. *Vədəsi çatmaq. Vədəsi qurtarmaq. – Şabanın vədəsi tamam oldu. Amma qayıtmağı üçün gərək şəhər əhlindən rizaməndlik alına idi*. Ə.Haqverdiyev. ☐ **Vədə olunmaq** – qabaqcadan müəyyən edilmək, şərtləşdirilmək. // Bir işi təxir etmək üçün təyin olunan vaxt, möhlət. *6 ay vədə verdi.* // Ümumiyyətlə, vaxt, zaman, çağ. *Könül həsrət, can müntəzir, göz yolda; Ömr azaldı, vədə keçdi san ilə*. M.V.Vidadi. *O vədə belə işləri başa düşürdüm, çünki on yeddi yaşında idim.* C.Məmmədquluzadə. *Mən cəhənnəmi həmişə Bakının mədənlərinə oxşar bir şey hesab edirdim və çox vədə də deyirdim ki, cəhənnəm yəqin Bakıda olacaq*. Ə.Haqverdiyev. **Heç vədə** – heç vaxt, qətiyyən. *Bu necə məleykə-önümdə belə; Axı mən heç vədə sevilməmişdim.* M.Araz.

2. B a x **vəd**. *Hər zaman Zeynal onu* [Mehribanı] .. *quru və boş vədələr ilə dolandırırdı.* S.Hüseyn. ☐ **Vədə vermək** – 1) səs vermək. *Yarım mənə vədə verdi; Dedi, gəl gəz buralarda.* Aşıq Abbas. *Keçən gün Zeynal səhər evdən çıxarkən vədə vermişdi ki, bu gün o, ən aşağısı üç yüz manat para alacaqdır.* S.Hüseyn; 2) qabaqcadan söyləmək, demək. *Bəli, anam vədə verdiyi günlər gəlib çatdı.* S.S.Axundov. **Vədəsinə əməl etmək** – verdiyi sözü yerinə yetirmək. **Vədəsinə xilaf çıxmaq** – verdiyi sözü yerinə yetirməmək. **Vədə(sini) almaq** – birinin müəyyən vaxtda qonaqlığa və s.-yə gəlməsi haqqında ondan söz almaq; dəvət etmək, çağırmaq. [Hatəmxan ağa] *israğagün aşnası zərdablı Qurban bəyə kağız yazırdı ki, Şamaxı cəngilərinin vədəsini alsın, toya göndərsin.* M.F.Axundzadə. *İranda Məhəmmədəli şahın tərəfdarı məhz bir neçə adamdır ki, öz şəxsi mənfəəti üçün, yəni kimi rüşvət alıb və kimi vədə alıb şaha kömək eləyirlər.* C.Məmmədquluzadə.

**VƏDƏXİLAF** *sif.* və *zərf* [*ər.*] Vədəsinə əməl etməyən, söz verib vaxtında yerinə yetirməyən, boynuna götürdüyü işi vaxtında görməyən. ☐ **Vədəxilaf çıxmaq** – verdiyi vədəni yerinə yetirməmək. *Hər şeydən artıq onu* [Nadiri] *düşündürən qonaqlıq gecəsi Məstan bəygilə getməməsi deyil, Zeynəbi aldatmağı və onun qarşısında vədəxilaf çıxmağı idi.* B.Talıblı. [Südabə:] *Siz Firidun, vədəxilaf çıxdınız, zəng etmədiniz.* M.İbrahimov. *Azərbaycanlı balası vədəxilaf çıxmaz.* Ə.Əbülhəsən.

**VƏDƏXİLAFLIQ** *is. dan*. Söz verib vaxtında yerinə yetirməmə, boynuna götürdüyü işi vaxtında görməmə; vədəsinə xilaf çıxma.

**VƏDƏLƏŞMƏ** "Vədələşmək"dən *f.is.*

**VƏDƏLƏŞMƏK** *f.* Görüşmək üçün aralarında sözləşmək, vaxt təyin etmək, bir-birinə söz vermək. *Saat 3-də görüşməyə vədələşdilər. Yola düşmək vaxtını qabaqcadan vədələşdik. – Laçın bu gün də onunla* [Gülyazla] *vədələşmişdi*. M.Hüseyn. *Qədir Qiyasla vədələşdiyi yerə getdi*. Mir Cəlal.

**VƏDƏLİ** *sif.* 1. Müəyyən vaxtı və müddəti nəzərdə tutan; müddətli. *Vədəli borc.*

2. Bir yerə müəyyən vaxtda dəvət olunmuş, dəvətli. *Mən bu axşam vədəliyəm. – Döşənibdi xəli, yar; Çuxası vəznəli yar; Durum, yollara baxım; Vədəlidi, gəli yar.* (Bayatı).

**VƏDƏSİZ** *sif.* 1. Müəyyən vaxtı, müddəti olmayan; müddəti, vaxtı təyin edilməmiş; müddətsiz, daimi. *Vədəsiz pasport.*

2. B a x **vaxtsız**. *Əzizim, o balıq-nan; Dəryada o balıqnan; Bir vədəsiz yel əsdi; Yandıq biz obalıqnan*. (Bayatı).

**VƏFA** *is.* [*ər.*] Sözünün üstündə durma; borcunu, təəhhüdünü yerinə yetirməkdə möhkəmlik; səbat, etibar. *Gördük bəyü bəyzadələrin yoxdu vəfası; Çox-çoxdu cəfası.* M.Ə.Sabir. // Məhəbbətdə sədaqət. *Rəqib qılsa cəfa, mən vəfa, vəli şadam; Ki, yaxşı yaxşıya uğrar, yaman yamana yetər.* Füzuli. *Vəfa rəsmin tutub gəl, ey pəri, cövrü cəfadan keç*. S.Ə.Şirvani. *Xəzana meyl elədi, almadı vəfa nəzərə; Yetişdi bülbülə çox-çox qəmü cəfası gülün*. Natəvan.

◊ **Vəfa etmək** – yetişmək, çatmaq kifayət etmək. *Ömrü vəfa etmədi.*

**VƏFADAR** *sif.* [*ər.* vəfa və *fars.* dar] *şair.* Vəfalı, dostluğunda sabit və sədaqətli olan, dostunu unutmayan. *Ey dilbəri-dildarım, sənsən əbədi yarım; Vey yari-vəfadarım, didarına müştaqəm.* Nəsimi. *Az ləfzilə ol büti-vəfadar;*

*Çox dərdini yarə qıldı izhar.* Məsihi. *Mərdlər ilə gəz ki, vəfadar olur; Namərdlərə yoldaş olan xar olur.* M.V.Vidadi. *Unudulmaz el yolunda canı qurban olanlar; Vətən mülkü abad yaşar vəfadarı görəndə.* S.Vurğun. // Dost, sevgili. *Getmə, getmə, görüm kimin yarısan; Hansı bəxtəvərin vəfadarısan?* Qurbani.

**VƏFADARLIQ** *is.* Vəfalılıq, dostluqda səbat və sədaqət. [Vaqif İrakli xana:] *İnşallah, bundan sonra da sədaqət və vəfadarlığımızda paydar olarıq.* Çəmənzəminli.

**VƏFALI** *sif.* Dostluğunda, məhəbbətində sadiq, möhkəm, sabit, etibarlı, sədaqətli. *Vəfalı yoldaş. – Vəfalı dost yad olmaz, görməsə yüz il səni.* (Ata. sözü). *Məktəb zamanı gəldi; Dur, ey vəfalı oğlum!* M.Ə.Sabir. *Lalə yalnız vəfalı bir arvad deyil, yaxın bir dost və köməkçi idi.* M.Hüseyn.

**VƏFALILIQ** *is.* Dostluqda, məhəbbətdə möhkəmlik, sabitlik; sədaqət, etibar.

**VƏFASIZ** *sif.* Dostluqda, məhəbbətdə sabit və möhkəm olmayan; vəfası olmayan; sədaqətsiz, etibarsız. *Nə qədr təndə canım var, işim fəğan olacaq; Vəfasız oldu mənə çünki yar, ağlayıram.* Heyran xanım. *Sevgi dildə şüar olsun! Vəfasıza çox ar olsun!* S.Vurğun. // *məc*. Etibarsız, fani, müvəqqəti. *Vəfasız dünyanın mehri gedir könlündən, aldanma*. Nəsimi.

**VƏFASIZLIQ** *is.* Dostluqda, məhəbbətdə sədaqətsizlik, səbatsızlıq, etibarsızlıq. [Nurəddinin] *içərisindən xəbəri olmayan adamlar onun belə lal durmasını vəfasızlıq zənn etdilər.* S.S.Axundov. // *məc*. Etibarsızlıq, fanilik, müvəqqətilik. *Bəzən .. Rüstəm odsuz, közsüz yanır, ömrün vəfasızlığından şikayətlənirdi.* S.Rəhimov.

**VƏFAT** *is.* [*ər.*] Ölmə, ölüm. *Ancaq bir nəfəri Mirzənin vəfatı yandırdı. O adam usta Zeynal idi*. Ə.Haqverdiyev. *Anasının vəfatından sonra Nurəddində böyük təğyir göründü.* S.S.Axundov. ☐ **Vəfat etmək** – ölmək. *Budur, üç il bundan qabaq Aslan, sonra övrəti vəfat etdilər.* C.Cabbarlı. *Gülpərinin anası qışda vəfat etmişdir.* S.Hüseyn.

**VƏGƏR** *bağl. klas*. Və əgər. *Gər dərd vəgər dəva sənindir; Hakim sənsən, riza sənindir.* Füzuli.

**VƏH** *nida* [*fars*.] Bəh, bəh-bəh, əcəb, pah. *Mərhəbalar! Vəh, nə əncam etdi, amma millət a!* M.Ə.Sabir. // B a x **vah**. *Dil deməkdən kəsilib, tən hərəkətdən, vəh, kim; Künciqəmxanəyə bir surəti-divar olubam*. Füzuli. *Çakər olur, rəsmdir, bəndeyi-fərmani-xan; Vəh, bu nə çakərdi kim, payına yüz xan düşər.* Q.Zakir.

**VƏHABİ** b a x **vəhhabi**.

**VƏHALONKİ** *bağl.* [*fars*.] O halda ki, halbuki. [İkinci qadın:] *Vəhalonki savadsız qadınlar üçün savad kursları açıb, tamam savadsız qadınları savadlandırırıq.* Ə.Haqverdiyev. [İsfahani:] *Vəhalonki işlər zahirdə göründüyündən çox-çox mürəkkəb və qəlizdir*. M.İbrahimov.

**VƏHDANİYYƏT** *is.* [*ər.*] Dini ehkama görə Allahın birliyi və varlığı.

**VƏHDƏT** *is.* [*ər.*] 1. Birlik, bütövlük, bölünməzlik. [Dəmirov] *bilirdi ki, qüvvət vəhdətdədir.* S.Rəhimov.

2. Ümumilik, eynilik, tam oxşarlıq. *Görüşlərin vəhdəti.*

3. Yalnızlıq, təklik, tənhalıq, xəlvət. *Vadiyivəhdət həqiqətdə məqami-eşqdir*. Füzuli.

**VƏHHABİ** *is.* [*ər.*] İslamda başlıca ehkamı vahid Allaha səcdə etməkdir.

**VƏHHABİLİK** *is.* XVIII əsrin sonlarında Mərkəzi Ərəbistanda yaranmış dini-siyasi cərəyan.

**VƏHM** *is.* [*ər.*] Əsli-əsası olmayan fikir; xəyal. // Yersiz qorxu, vahimə, şübhə. *Gözü qəmzən gəlib can qəsdinə, amma budur vəhmim; Düşə nahəq yerə qanlar iki sərdar arasında.* Q.Zakir. *Allah, Allah, nədir bu tufanlar? Az qalır vəhmdən çıxa canlar.* M.Ə.Sabir. ☐ **Vəhm etmək** – qorxmaq, ehtiyat etmək. *Vəhm etdi ki, olsa yarə vasil; Nöqsan ola canü cahə hasil*. Füzuli.

**VƏHMƏ** b a x **vahimə**. *Meşənin vəhməsi Pəri xanımı götürdü. Ürəyinə qorxu düşüb çıxdı çinar ağacına.* (Nağıl). ☐ **Vəhmə basmaq** – b a x **vahimə basmaq (götürmək, bürümək)** (“**vahimə**”də). *Budur, qarşıladı onu bir nəfər; Qorxudan Dadaşı basdı vəhmələr...* M.Müşfiq. **Vəhmə düşmək** – b a x **vahiməyə düşmək** (“**vahimə**”də). **Vəhmə salmaq** – b a x **vahiməyə salmaq** (“**vahimə**”də).

**VƏHMƏLƏNDİRMƏ** "Vəhmələndirmək"-dən *f.is.*

**VƏHMƏLƏNDİRMƏK** b a x **vahimələnmək**. [Ana] *hərarətli dodaqları ilə guruldudan vəhmələnən uşağının ağlar gözlərini öpərkən, başına ağır bir şey dəydi.* Mir Cəlal.

**VƏHMƏLİ** b a x **vahiməli**. *Evdə nəyinsə intizarını çəkən vəhməli bir sükut vardı.* Ə.Əbülhəsən.

**VƏHMNAK** *sif.* [*ər.* vəhm və *fars.* ...nak] Qorxaq, vahiməyə düşən, şübhəyə düşən, vahiməyə, xəyala uyan.

**VƏHŞ** *sif.* [*ər.*] Vəhşi, yabanı, əhliləşməmiş. *Ətrafını teyrü vəhş almış; Vəhşət onu bir hisarə salmış*. Füzuli.

**VƏHŞƏT** *is.* [*ər.*] 1. Vəhşilik, mədəniyyətsizlik. [Məşədi bəy:] *Yəqin sənin də bacın vəhşilərlə pəncələşməkdən yorulub, özünü yandırıb. Sizdəki vəhşətlərdən xəbərim var*. M.Hüseyn.

2. Qorxu, dəhşət. *Hamının üzündə vəhşət, iztirab və qorxu əlaməti görünürdü*. P.Makulu. ☐ **Vəhşət etmək (eləmək)** – qorxmaq, dəhşətə gəlmək. *Nə Məcnunam ki, vəhşət eyləyim Leyla cəfasından.* S.Ə.Şirvani. // Tənha yerlərdə təklikdə hiss olunan qorxu; vahimə, qarabasma. **Vəhşət vermək** – dəhşətə salmaq, dəhşətə gətirmək, bağrını yarmaq. *Nizə və təbərlərin saplarındakı düşmən sümükləri vəhşət verirdi*. Çəmənzəminli.

3. Hüzn, kədər, tənhalıq. [Sitarə:] *Əsib badi-xəzan vəhşət düşürtdü səhni-gülzarə*. C.Cabbarlı.

**VƏHŞƏTƏFZA** *sif.* [*ər.* vəhşət və *fars.* əfza] *klas*. Dəhşəti (vəhşəti) artıran, insanı dəhşətə gətirən. *Hicrətdən ta bu günə qədər din və iman xatirinə elə işlər görməkdəyik ki, onları zikr eləmək vəhşətəfzadır.* M.F.Axundzadə.

**VƏHŞƏTLİ** *sif.* Qorxulu, dəhşətli. [Münəccimbaşı:] *Nə lazım olmuşdu ki, belə vəhşətli xəbəri .. verib, bu qalmaqala səbəb ola.* M.F.Axundzadə. *Eşitdikcə bu vəhşətli sözləri; Əsdi bədəni, qızardı gözləri.* A.Səhhət.

**VƏHŞİ** *sif.* 1. İbtidai halda olan, ibtidai mədəniyyət pilləsində olan; ibtidai. *Vəhşi tayfalar. İnsanlar vəhşi halında yaşadıqları zaman.* – [Skif tayfası] *cəsarətli, vəhşi xasiyyətli və köçəri olan müxtəlif qəbilələrdən ibarət idi.* A.Bakıxanov. // İs. mənasında. [3-cü cəngavər:] *Anasının namusunu ləkələmək istəyən vəhşilərdən dörd nəfərini vurub yerə sərdi.* M.Hüseyn.

2. Heyvan və quşlar haqqında: insanlara öyrənməmiş, ələ öyrənməmiş, çöldə sərbəst yaşayan. *Vəhşi pişik. Vəhşi ördək. Vəhşi öküz.* – *Vəhşi heyvanlardan Lənkəran sahəsində bəbir və respublikanın bütün meşələrində çoxlu ayı, canavar, tülkü və Sibir samuru vardır.* M.Qaşqay. // *İs. mənasında*. Vəhşi heyvan. *Musiqi daşları gətirir dilə; Ram olur səsinə vəhşilər belə*. S.Vurğun.

3. Yabanı, öz-özünə çöllərdə bitən. *Göyərən vəhşi güllər; Çığıran arzum kimi... Necə belini bükdü; Ocağını qaraltdı.* B.Vahabzadə.

4. *məc*. Adamdanqaçan, adamayovuşmaz, ürkək, utancaq. *Vəhşi uşaq. Bu qız lap vəhşidir ki.*

5. *məc*. Adamsız, insansız, tənha; insan ayağı dəyməmiş, məskun olmayan. *Vəhşi çöllər.* // Qorxunc, vəhşətli, heybətli. *Vəhşi qayalar. – Bu vəhşi ormandan uçmaq dilərdin; Bu qara zindandan qaçmaq dilərdin.* M.Müşfiq.

6. Azğın, qudurmuş, qaba, tərbiyəsiz. *Vəhşi hərəkət*. – [Əbülhəsən bəy:] *Köməksiz və yardımsız bir qızı sərxoş və vəhşi zabitlərin əlindən xilas etmək vəzifəm idi.* M.S.Ordubadi. // Önüalınmaz, azğın, qızmış, coşmuş. *Mübaşir Məmməd vəhşi ehtirasla yanan gözlərini bir də Gülzara tərəf çevirdi..* M.İbrahimov. // Qeyri-mədəni, mədəni cəmiyyətə yaraşmayan, mədəniyyətə yaraşmayan, mədəniyyətə zidd olan. "*Molla Nəsrəddi*"*nin qəsdi vəhşi adətlərin ortalıqdan götürülməyi yolunda çalışmaqdır.* C.Məmmədquluzadə. *İnqilabdan əvvəl vəhşi adətlərdən biri də qan düşmənçiliyi idi.* S.S.Axundov. [Zeynal] *qızmış vəhşi bir baxışla Mehribana tərəf yürüdü*. S.Hüseyn.

**VƏHŞİCƏ(SİNƏ)** *zərf* və *sif.* Vəhşi kimi; amansızcasına, azğıncasına. *Vəhşicəsinə öldürmə. Vəhşicəsinə hərəkət. Vəhşicəsinə rəftar. Vəhşicəsinə divan tutmaq.*

**VƏHŞİLƏŞMƏ** "Vəhşiləşmək"dən *f.is.*

**VƏHŞİLƏŞMƏK** *f.* Vəhşi halına gəlmək.

**VƏHŞİLİK** *is.* 1. Vəhşi heyvanın halı, vəziyyəti, xassəsi. *Pələngin vəhşiliyi.*

2. Vəhşi hərəkət, azğınlıq, qudurğanlıq. *Vəhşilik etmək. – Belə də o, mən burada olduğuma görə, özünü ələ alacaq və məni kədərləndirməmək üçün vəhşilik etməyəcəkdir*. M.S.Ordubadi.

**VƏHŞİTƏBİƏT(Lİ)** *sif.* [*ər.*] Vəhşi xasiyyətli, vəhşi, mədəniyyətsiz, çox qaba, azğın.

**VƏHŞİYANƏ** [*ər.*] b a x **vəhşicəsinə**. *Vəhşiyanə hərəkət.*

**VƏHŞİYYƏT** *is.* [*ər.*] Vəhşilik. *Lənət olsun o günə ki, maarif və mədəniyyət qapıları bizim üzümüzə bağlanıb, bizi cəhalət və vəhşiyyət vadisində sərgərdan qoydu*. Ü.Hacıbəyov.

**VƏHY** *is.* [*ər.*] İslam dini etiqadına görə, bir fikir və ya hökmün Allah tərəfindən peyğəmbərə ilham olunması, çatdırılması, verilməsi. // *məc*. İlahi səs, son dərəcə gözəl, məftunedici səs mənasında. *Hər nəfəsin bir ayə, vəhyi-müqəddəs kimi; Dünyada nemətmi var bu səndəki səs kimi.* Ə.Cavad.

**VƏKALƏT** *is.* [*ər.*] 1. Bir işi görmək üçün birisinə verilən hüquq; vəkillik. *Mələkənin hüzuruna göndərilən heyətə geniş vəkalət verilmişdir.* M.S.Ordubadi.

2. Nazirlik, nəzarət, vükəlalıq.

**VƏKALƏTƏN** *zərf* [*ər.*] Vəkalət yolu ilə, vəkalətlə.

**VƏKALƏTNAMƏ** *is.* [*ər.* vəkalət və *fars.* ...namə] Vəkillik kağızı; birinin bir işi görmək üçün vəkil olduğuna dair vəkil edən şəxs və ya idarə tərəfindən verilən sənəd. *Pul almaq üçün vəkalətnamə vermək. Vəkalətnaməsini təqdim etmək.* – [Ağa Salman:] *Siz də mənim adıma vəkalətnamə yazdırıb göndərin.* M.F.Axundzadə. [Aslan bəy:] *Burada heç bir çətin iş yoxdur. Cabbar bəyi bu saat apar notariusun yanına, bir vəkalətnamə yazdır*. N.Vəzirov.

**VƏKİL** *is.* [*ər.*] 1. Vəkalətə əsasən iş görən şəxs. [Səkinə xanım:] *Mənim bu saatda nə atam var, nə anam, nə qardaşım; özüm öz vəkiliməm.* M.F.Axundzadə. ☐ **Vəkil etmək** – öz əvəzinə bir işi görmək üçün birinə vəkalət vermək, bu işi ona tapşırmaq. [Fərhad:] *Ancaq mən heç kəsi vəkil eləməmişdim, məni evləndirsin*. Ə.Haqverdiyev. *Dostu Mirzə Qulamı vəkil eləmişdir ki,* “*Get, yer seç, ev tut, mənə xəbər ver*”. Mir Cəlal.

2. Məhkəmədə tərəflərin əvəzində işi aparan şəxs, hüquqçu, advokat. [Səkinə xanım:] *Yaxşı, indi de görüm, biz kimi vəkil tutaq?* M.F.Axundzadə. [Qəhrəmani:] *Sən ali təhsil almış bir vəkil olacaqsan*. M.İbrahimov.

3. *tar*. Nazir. *Baş vəkil.*

4. *tar*. Deputat.

**VƏKİLLİK** *is.* Vəkilin gördüyü iş, vəkil vəzifəsi. ☐ **Vəkillik etmək** – 1) vəkil sifəti ilə məhkəmədə və s.-də başqasının işini aparmaq; 2) başqasının əvəzinə danışmaq, iş görmək (mənfi mənada işlənir).

**VƏQƏ** *is.* [*ər.*] Baş vermiş hadisə, macəra, qəziyyə.

**VƏQF** *is.* [*ər.*] İslamiyyətdə: dini məqsədlə bir şəxs tərəfindən hər hansı bir iş üçün təxsis edilən və ya bağışlanan mal-mülk, pul və s. *Hacı Məcid əfəndi Cümə məscid mədrəsəsinin nizamını pozdu və mollalara vəqfdən verilən məvacib və ianəni kəsdirdi*. C.Məmmədquluzadə. *Gələn nazirlərdən başqa, ocağın öz ixtiyarındakı vəqf yerlərini kəndlilər özləri əkir, becərir və məhsulunu payızda daşıyıb türbənin anbarlarına doldururdular*. Şamilov. ☐ **Vəqf etmək** – 1) bir mal və mülkü dini məqsədlər üçün ayırmaq, vermək, bağışlamaq, təxsis etmək. *Amma bu bədbəxt də molla, seyidin kələyinə düşüb cəmi dövləti məscidə vəqf etmiş.* S.S.Axundov; 2) *məc.* tamamilə həsr etmək, sərf etmək, vermək. *Vəsiyyətim budu, Seyyid, vəfatım olduqda; Nə qalsa məndən, onu vəqf edin, şərabə verin*. S.Ə.Şirvani. *Ana övlada vəqf edər özünü; Yumamaz, yummasa uşaq gözünü*. M.Ə.Sabir. *Belədirsə, həmişəlik yetimlər üçün bir məktəb açın, aldığınız prosentlərin cüzi bir hissəsini bu xeyir işə vəqf ediniz.* N.Nərimanov.

**VƏQFİYYAT** *is.* [*ər.*] Vəqf olunmuş şeylər – mal, mülk, pul və s. (b a x **vəqf**).

**VƏQFİYYƏ** [*ər.*] b a x **vəqfnamə**.

**VƏQFNAMƏ** *is.* [*ər.* vəqf və *fars*. ...namə] Bir vəqfin şərtlərini və idarə olunma qaydalarını müəyyən edən sənəd (b a x **vəqf**).

**VƏQT** [*ər.*] b a x **vaxt**

**VƏQTA Kİ** *bağl. köhn.* Bir zaman ki, bir halda ki, elə ki, o vaxt ki. *Vəqta ki qopur bir evdə matəm; Təşkil edilir büsati-ehsan.* M.Ə.Sabir. [Məmmədhəsən ağa:] – *Rusiyə*

*ilə, – dedi, – anlaşmaq lazımdır, vəqta ki özləri buna müştaqdır: böyük məmləkətdir, nizamlı qoşunu var*. Çəmənzəminli.

**VƏL** *is.* Alt tərəfindəki oyuqlara balaca daşlar keçirilmiş, yaxud yan-yana dəmir dişləri olan ağacdan, taxtadan qayrılmış ibtidai xırman aləti (taxıldöyən alət). *Biçinə çin gərəkdi, xırmana vəl*. S.Ə.Şirvani. *Əsəd minib vəlin üstə və öküzləri çubuq ilə sürür*. C.Məmmədquluzadə. *Xırmanlarda hələ də dərz döyənlərin səsi, vəl çəkən atların ayaqlarının tappıltısı eşidilir*. İ.Əfəndiyev. // *məc.* Çox iri, yöndəmsiz şey haqqında. *..Xan yaralanmış ayı kimi nərə çəkdi, vəl boyda .. əlini havada yelləyib maliyyə vəzirinin üzünə vurdu*. M.İbrahimov. [Kafirin] *ayaqları vəl kimidir, saçları at quyruğu kimi*. S.Rəhimov.

**VƏLAKİN** *bağl.* [*ər.*] *klas*. Lakin, amma, ancaq, fəqət.

**VƏLƏ** *is. məh*. Bir yaba dolusu, bir yabanın götürə biləcəyi qədər ot, kol və s.; şələ, qucaq. *Qaranlıq çökəndə Qaraxan Məcidin qəbri üstə bir vələ tikan odlayıb alov elədi*. S.Rəhimov.

**VƏLƏD** *is.* [*ər.*] *köhn*. Uşaq, oğul, övlad. *Amandı! Qoymayın, övladınız azıb çıxa yoldan; Ola bu yaxşı vələdlər yaman; Bu boyda-bu boyda!* M.Ə.Sabir.

**VƏLƏMBƏ** *is.* Göz qapağı.

**VƏLƏMİR** *is. bot.* Taxıl fəsiləsindən dənli yem bitkisi.

**VƏLƏS** *is. bot*. Oduncağı bərk, qollu-budaqlı hündür meşə ağacı. *Vələs Azərbaycanın aşağı dağ qurşağı meşələrində ən çox yayılmış ağaclardandır. – Meşələr görmüşəm, qoca palıdlı; Hündür vələsləri verib baş-başa*. R.Rza.

**VƏLƏZZALİN** [*ər.*] Ərəbcə bir tərkib olub, azərbaycanca ancaq uzunçuluq mənasında işlənir. *Vələzzalin söyləmə* (*uzunçuluq etmə*).

**VƏLİ**[1] *is.* [*ər.*] 1. Hami, himayəçi.

2. Yaxın dost.

3. Ağa.

**VƏLİ**[2] *bağl.* [*fars.*] *klas*. Amma, lakin, fəqət. *Dedi: əsirgəməm bir qaşıq qanı; Vəli laf vuranlar gen gündə hanı?* Q.Zakir. *Vəslüvə şad, vəli firqətüvə naşadam*. Heyran xanım. *Yüz cəfa gördüm, vəli bir gəz şikayət etmədim*. S.Ə.Şirvani.

**VƏLİƏHD** *is.* [*ər.*] 1. Padşahın yerini tutmalı olan şəxs. *Vəliəhd bu etimadsızlığı .. sərdar Rəşiddən gördüyü üçün, onlarla çox etinasız bir surətdə görüşdü*. M.S.Ordubadi. [Anaxatun] *yaxşı bilirdi ki, .. yeganə vəliəhdini vurmağa xanın əli gəlməzdi*. M.Rzaquluzadə.

2. *məc*. Oğul, qız, övlad. [Piri baba:] *Sən də mənə vəliəhd olacaqsan*. S.S.Axundov.

3. *zar*. Əvəz, birinin yerini tutmalı olan şəxs. [Müaviyyə Abdullaya:] *Səni yerimdə vəliəhd etmək istəyirəm*. Mir Cəlal.

**VƏLİƏHDLİK** *is.* Taxt-taca sahib olma qaydası. *Hidayət ağanın düzəlib işi; Vəliəhdliyi möhkəm olubdur*. Q.Zakir. *Azərbaycanlılar Qızıl Arslan tərəfindən vəliəhdliyə namizəd edilmiş bu gənci həddindən artıq sevirdilər*. M.S.Ordubadi.

**VƏLİM** *is. məh.* Çör-çöp. *Bir bağ vəlim tapammır biçarə yandıra; Möhtacdır özü və əyalı hərarətə*. M.Möcüz.

**VƏLİNEMƏT** *is.* [*ər.*] *köhn*. Birini böyüdüb bəsləyən, saxlayan, boynunda haqqı olan adam.

**VƏLİYYÜNNEMƏ(T)** [*ər.*] *köhn*. bax **vəlinemət**. [Münəvvər xanım:] *Ana, insaf elə, mürüvvət elə, insan da Qulam xan kimi nakəsdən ötrü öz vəliyyün-nemətinə ağ olar?* M.S.Ordubadi.

**VƏLLƏMƏ** "Vəlləmək"dən *f.is.*

**VƏLLƏMƏK** *f.* Xırmanda taxılı vəl ilə döymək.

**VƏLVƏLƏ** *is.* Səs-küy, gurultu-patırtı, həyəcan, çaxnaşma, qarmaqarışıqlıq. *O gecəki vəlvələdən ancaq bunu görə bildim*. A.Şaiq. ☐ **Vəlvələ düşmək** – qarmaqarışıqlıq düşmək, çaxnaşma düşmək, həyəcan (gurultu-patırtı) düşmək. **Vəlvələ salmaq** – qorxu salmaq, çaxnaşma salmaq, həyəcan salmaq. *Həqiqət bu xəbər cəmi müsəlman şəhərlərində xalq arasında bir vəlvələ saldı*. C.Məmmədquluzadə. [Əmrulla Gülsabaha:] *Qüdrətgilin evinə o yandan vəlvələ salmışsan..* C.Cabbarlı. **Canına** (**cisminə** və s.) **vəlvələ düşmək** – qorxuya düşmək, təşvişə düşmək, qorxudan əsmək. *Oğlan, sən uşaqsan, cavansan hələ; Yenicə cisminə düşüb vəlvələ*. M.V.Vidadi. *Növbətçinin* "*Qalx!*" *səsi tövlədəkilərin içinə vəlvələ saldı*. Mir Cəlal.

**Canına vəlvələ salmaq** – çox qorxuya salmaq, lərzəyə salmaq. [Hacı Qara:] *Onların qılınc-tüfəngi o qədər məni qorxutmur ki, silisti, apar-gətiri canıma vəlvələ salır.* M.F.Axundzadə.

**VƏN** *is. bot.* Qabığı ağ, bərk oduncaqlı meşə ağacı. *Neçə il qabaq quruyub çığrığa dönmüş yoğun vənlərin qabıqları çürümək üzrə idi.* Ə.Vəliyev.

**VƏNGİLDƏMƏ** "Vəngildəmək"dən *f.is.*

**VƏNGİLDƏMƏK** *f.* Vurulmaqdan və ya başqa bir səbəbdən yazıq-yazıq, ucadan səs çıxarmaq (it haqqında).

**VƏNGİLDƏTMƏK** *icb.* Vəngildəməsinə səbəb olmaq.

**VƏNGİLTİ** *is.* Vurulmaq və ya başqa bir səbəb nəticəsində ağrıdan itin yazıq-yazıq çıxardığı səs.

**VƏR¹** *is. məh.* Əkin və ya otlağın biçilməli olan bir sahəsi. *Sərvinazın manqa üzvləri vəri başa vurub geri qayıtdıqda yenə də nəşəli idilər.* Ə.Vəliyev.

**VƏR²** *is.* [*fars.*] Tərəf, cəhət.

**VƏR³** *bağ.* [*fars.*] Mömin, dindar olma.

**VƏRASƏT** *is.* [*ər.*] bax **varislik**. *Şirvan şahlığının hökumət quruluşundakı vərasət məsələsi ləğv olunduğu zaman Şimali Azərbaycanın mərkəzini Şirvana köçürmək və oranı Azərbaycan paytaxtı adlandırmaq mümkün idi.* M.S.Ordubadi.

**VƏRDƏLƏMƏ** bax **vərdənələmə**.

**VƏRDƏLƏMƏK** bax **vərdənələmək**.

**VƏRDƏNƏ** *is.* 1. Xəmir və s. yaymaq üçün ağacdan və s.-dən qayrılan silindrşəkilli alət. *Gənclər bir tərəfi nazik olan vərdənəyə bənzər millərdən yapışıb oynatmağa başladılar.* Çəmənzəminli. [Usta] *şagirdinin vərdənə ilə yaydığı kündələri kürəyə sərir, tez-tez oda atır, neçə dəqiqə keçməmiş, buğlanan səngəkləri qızmar kürədən çıxarırdı.* Mir Cəlal.

2. *tex.* Yeri və ya başqa bir şeyi hamarlamaq üçün işlədilən müxtəlif alətlərin adı. *Əl vərdənəsi. Traktora qoşulan vərdənə. Qırı vərdənə ilə hamarlamaq.*

**VƏRDƏNƏLƏMƏ** "Vərdənələmək"dən *f.is.*

**VƏRDƏNƏLƏMƏK** *f.* Vərdənə ilə yaymaq, yastılamaq, hamarlamaq.

**VƏRDƏNƏLƏNMƏ** *dan.* "Vərdənələnmək"dən *f.is.*

**VƏRDƏNƏLƏNMƏK** *məch.* Vərdənə ilə yayılmaq, yastıladılmaq, hamarladılmaq.

**VƏRDİŞ** *is.* Təcrübə, təkrarlama və çox işləmək nəticəsində əldə edilən iş bacarığı, adət edilmiş şey; insanın öz həyatının müəyyən dövründə öyrəşdiyi, adət etdiyi şey. *Əmək vərdişi. – Uzun illərin vərdişi onu* [Kərimbəyi] *yenə hər şeydən ayıraraq, buraya, dəftər-qələmə sarı gətirdi.* Mir Cəlal. ☐ **Vərdiş olmaq (etmək)** – 1) adət etmək, öyrəşmək, alışmaq. *Qızının gözlərindən bu hərgünkü təlaşlı sualı oxumağa vərdiş etmiş ana: – Yoxdur, qızım! – dedi.* Ə.Məmmədxanlı; 2) dadanmaq. // Adət. [Qəhrəman:] *Dədə-babadan qalma bu vərdiş sizi olduqca qorxulu bir yola yuvarlaya bilər.* Ə.Vəliyev.

**VƏRDİŞLİ** *sif.* Vərdişi olan, vərdiş əldə etmiş, bir şeyə adət etmiş; təcrübəli. // Vərdiş etmiş, adət etmiş.

**VƏRƏQ** *is.* 1. Müəyyən şəkildə və ölçüdə kəsilmiş kağız parçası, kağız təbəqəsi. *Bir vərəq kağız.* // Səhifə. *Bir yeni aləm var hər vərəqində.* S.Vurğun.

2. *mətb.* Çap mətninin on altı səhifədən ibarət olan ölçü vahidi. *Kitab 10 çap vərəqidir.* ☐ **Müəllif vərəqi** – müəllif qonorarını hesablamaq üçün vahid götürülən 40.000 mətbəə nişanı.

3. Yarpaq.

◊ **Vərəqi çevrilmək** – halı dəyişmək, pozulmaq, pərt olmaq; peşman və ya narazı olmaq. *Məni görən kimi vərəqi çevrildi.*

**vərəq-vərəq** *zərf* 1) Tək-tək vərəqlərlə, hər bir vərəq ayrılıqda. *Kitabı vərəq-vərəq açmaq*; 2) *məc.* bir-birinin ardınca, bir-bir. *Üzündəki qəm dastanı açılmışdır vərəq-vərəq.* S.Vurğun.

**VƏRƏQBƏVƏRƏQ** *zərf* Vərəq-vərəq, vərəqləri bir-bir çevirərək. *Kitabı vərəqbəvərəq gözdən keçirdim.*

**VƏRƏQƏ** *is.* 1. Kiçik vərəq; vərəq. *Sual vərəqəsi. Anket vərəqəsi.*

2. Üzərində mühüm siyasi xəbərlər və s. çap olunmuş kiçik kağız vərəqi. [Müsafir:] *Sən məndən sonra söylədiklərini anlatmalısan. Tapşırdıqlarımı unutma! Al, sənə lazım olan kitabları və vərəqələri də verim.*

H.Nəzərli. *Mirbalayev vərəqəni alıb şam işığında gözdən keçirdi.* M.Hüseyn. // Üzərində işin gedişi və s. haqqında məlumat yazılmış kağız. *Cəlilzadə yavaş-yavaş məktəblərin şəbəkəsini göstərən xüsusi enli vərəqəni çıxarıb, stolun üstünə sərdi.* S.Rəhimov.

◊ **Vərəqəsini bükmək** – tərk etmək, bir daha məşğul olmamaq, nəhayət vermək. [Kazım:] *Yox, bir söz demir.. Ancaq deyir ki, Səfər qaçaqlığın vərəqəsini büksün, kasıblığa qurşansın.* Çəmənzəminli.

**VƏRƏQLƏMƏ** "Vərəqləmək"dən *f.is.*

**VƏRƏQLƏMƏK** *f.* Kitabın və s.-nin vərəqələrini (səhifələrini) bir-bir çevirmək. *Kitabı vərəqləmək. – Şəmsiyyə hamıdan axırda durmuş, nə isə əlində bir kitab vərəqləyir, məşğul kimi görünürdü.* M.İbrahimov.

**VƏRƏQLƏNMƏ** "Vərəqlənmək"dən *f.is.*

**VƏRƏQLƏNMƏK** *məch.* Vərəqləri, səhifələri bir-bir çevrilmək. *Kitab çox vərəqlənməkdən dağılmışdır. – Bu sinə dəftəri hər gün açılır, onun tükənməz səhifələri Ağabəyimin qarşısında vərəqlənirdi*. Çəmənzəminli.

**VƏRƏQLƏTMƏK** *icb*. Vərəqləri, səhifələri bir-bir açdırmaq, çevirtdirmək.

**VƏRƏQPARƏ** *is.* [*ər.* vərəq və *fars*. ...parə] 1. Kağız parçası. *Kitabi-mərifətdir əhli-həqqə hər vərəqparən*. S.Ə.Şirvani.

2. Heç bir qiyməti və əhəmiyyəti olmayan kağız parçası.

**VƏRƏM** *is.* [*ər.*] *tib*. Ağ ciyərdə və bəzən bədənin başqa hissələrində Kox mikrobu adlanan xüsusi mikrobun törətdiyi yoluxucu xəstəlik. *Ciyər vərəmi. Sümük vərəmi. Vərəm aşısı. Vərəm mikrobu.*

**VƏRƏMLƏMƏ** "Vərəmləmək"dən *f.is.*

**VƏRƏMLƏMƏK** *f.* 1. B a x **vərəmlənmək**. *Yüksəklərə, mavi göylərə doğru boylanan bacalar Qaraşəhərin zirzəmilərində vərəmləyən fəhlələrin dastanını oxuyurdu.* M.S.Ordubadi.

2. *məc*. Dərdə düşmək, dığlamaq. *Vaqif haqdan dilər lütfü kərəmlər; Belə yerdə duran, vallah, vərəmlər*. M.P.Vaqif.

**VƏRƏMLƏNDİRİLMƏ** "Vərəmləndirilmək"dən *f.is.*

**VƏRƏMLƏNDİRİLMƏK** *məch.* Vərəm xəstəliyinə tutulmasına səbəb olmaq, dığlandırılmaq.

**VƏRƏMLƏNDİRMƏ** "Vərəmləndirmək"dən *f.is.*

**VƏRƏMLƏNDİRMƏK** b a x **vərəmlətmək**.

**VƏRƏMLƏNMƏ** "Vərəmlənmək"dən *f.is.*

**VƏRƏMLƏNMƏK** *f.* Vərəm xəstəliyinə tutulmaq.

**VƏRƏMLƏTMƏ** "Vərəmlətmək"dən *f.is.*

**VƏRƏMLƏTMƏK** *f.* 1. Vərəmlə xəstələndirmək.

2. *məc*. Dığlandırmaq, azara salmaq, dərdə salmaq (acıqdan, fikirdən, qüssədən və s.-dən).

**VƏRƏMLİ** *sif.* və *is.* Vərəm xəstəliyi olan.

**VƏRƏNDAZ** *is. dan*. Götür-qoy, ölçüb-biçmə, təkrar-təkrar yoxlama. ☐ **Vərəndaz etmək** – götür-qoy eləmək, ölçüb-biçmək, təkrar-təkrar yoxlamaq. [Xoruz-oğlu:] *Vallah, o qədər vərəndaz eləmədim, ancaq kişi təsdiq elədi*. S.Rəhimov.

**VƏRƏSAT** *is.* [*ər.*] b a x **varislik**.

**VƏRƏSƏ** *is.* [*ər.*] *köhn. rəs.* Ölən bir adamdan sonra yaxın qohumluq və ya vəsiyyət yolu ilə onun mülk və malına sahib olan şəxs(lər); varis(lər). *Vərəsə arasında dava .. vaqe olubdur.* M.F.Axundzadə. *Sərdar Rəşidin vərəsələri ev şeylərini öz aralarında təqsim etdikdən sonra, orada Mahru üçün heç bir şey qalmırdı.* M.S.Ordubadi.

2. *məc*. Bir işi davametdirici. *İndi mən o babamın gənc bir vərəsəsiyəm; Yeni həyatda onun davam edən səsiyəm*. S.Rüstəm.

**VƏRƏSƏLİ** *sif.* Vərəsəsi olan, varis(lər)i olan.

**VƏRƏSƏLİK** *is.* Vərəsənin hüquqi vəziyyəti; varislik.

**VƏRƏSƏSİZ** *sif.* Vərəsəsi, varisi olmayan.

**VƏRLƏMƏK** *f. k.t. məh*. Əkilmiş yeri zolaqlar şəklində sahələrə ayırmaq.

**VƏRNİ** *is.* Xovsuz xalça növü.

**VƏRŞİKƏST** *is.* [*fars.*] *köhn*. Böyük zərər nəticəsində tacirin mayadan düşməsi, borclarını ödəmək iqtidarını itirməsi, iflas etməsi; iflas, müflislik. ☐ **Vərşikəst olmaq (düşmək)** – iflas etmək, müflis olmaq, sınıq çıxmaq. [Ağa Qurban] *özünü yerə vurub dedi: – Vərşikəst olmuşam*. Ə.Haqverdiyev.

**VƏRŞİKƏSTLİK** *is.* Müflislik, sınıq çıxma, iflas.

**VƏRTƏ** *is.* [*ər.*] Uçurum; təhlükə. *Boz at, səni sər töylədə bağlaram; Əgər bizi bu vərtədən qurtarsan; Ayağına qızıl, gümüş nallaram.* "Qaçaq Nəbi".

**VƏSAİT** *is.* [*ər.* "vasitə" söz. cəmi] 1. B a x **vasitə** 2-ci mənada. // Ləvazimat. *İstehkam hissələrinin əlində kifayət qədər vəsait olmurdu.* Mir Cəlal.

2. Pul, kredit. *Maliyyə vəsaiti. Maddi vəsait. İnşaat üçün vəsait buraxmaq. Ayrılmış vəsaitdən bütünlüklə istifadə etmək.*

3. Ehtiyat qüvvələri. *Ölkəmiz tükənməz vəsaitə malikdir.*

4. Dərslikdən əlavə tədris üçün lazım olan kitab və s. *Tədris vəsaiti. Bu kitab nə dərslikdir və nə də öz-özünə öyrənənlər üçün tədris vəsaiti.*

**VƏSAİTLİ** *sif.* Vəsaiti olan.

**VƏSATƏT** *is.* [*ər.*] *köhn. rəs.* Arada vasitə olma; vasitəçilik, araçılıq, miyançılıq; rəsmi xahiş. *Vəsatət istəyirəm qəhrə getmiş eşqin üçün; Necə ki, tövbəni rind sındırar rizası ilə.* Şəhriyar.

**VƏSƏT** *is.* [*ər.*] 1. Orta. *Böyükxanım evin vəsətində döşək üstündə .. əyləşmişdir.* M.S.Ordubadi.

2. *mus.* Orta səs. *Tahir zildən vəsətə keçəndə bütün salon heyrət içində susmuşdu.* M.Hüseyn.

**VƏSF** *is.* [*ər.*] 1. Bir şəxsin və ya bir şeyin malik olduğu sifət, keyfiyyət, hal; səciyyə. *Zatinə kimsə irməz, vəsfini bilməz.* Nəsimi. [Vəzir:] *Bəlkə bu tədbir ilə dəxi Teymur ağanın vəsfi onun dilinə gəlməyə.* M.F.Axundzadə. ☐ **Vəsf etmək** – bir şeyin xüsusiyyətlərini, sifətlərini, keyfiyyətini təfərrüatı ilə göstərmək, təsvir etmək. *Vaiz bizə dün duzəxi vəsf etdi.* Füzuli. *Bu məktubumda axund Molla Sadığın vəz məclisini sənə vəsf edirəm.* M.F.Axundzadə. *Vəsf eləyim bir şeirlə dayandığım bu təpəni.* M.Rahim.

2. Tərif, hüsn, mədh. *Yaza bilməz ləblərin vəsfin tamami-ömrdə.* Füzuli. *Mən sənin vəsfini, ey mahi-kərəm; Hafizdən, Camidən artıq söylərəm!* M.P.Vaqif. *Vəsfin yayılıb mahala; Maşallah o xəttü xala.* Aşıq Ələsgər. ☐ **Vəsf etmək** – tərif etmək, mədh etmək. *Nəsimi necə vəsf etsin ki, hüsnün binəhayətdir.* Nəsimi. *Edər vaiz mükərrər vəsf abi-kövsəri, amma.* Q.Zakir.

**VƏSFƏGƏLMƏZ** *sif.* Təsvir edilməsi mümkün olmayan, təsvirəgəlməz. [Şirvan hakimi] *saysız əsgər və hesabsız qoşunla tam bir cəlal və vəsfəgəlməz bir dəbdəbə ilə Bayat qalasını dörd bir tərəfdən mühasirəyə aldı.* Mirzə Adıgözəlbəy.

**VƏSFİ** *sif. köhn.* Bir şəxsin və ya şeyin xüsusi hal və keyfiyyətinə, vəsfinə aid olan. ◊ **Vəsfi analiz** *kim.* – maddənin tərkibinin tədqiqi, onun tərkibini təşkil edən elementlərin müəyyən edilməsi.

**VƏSFİ-HAL** *is.* [*ər.*] 1. Bir şəxs və ya şeyin hal və xüsusiyyətini söyləyərək təsvir etmə. *Yarın vəsfi-halı düşəndə yada; Qəm yeyər könlümü, dad-aman eylər.* Şair Vəli.

2. *mus.* Məzəli kütləvi xalq oyunu zamanı oxunan bir mahnı.

**VƏSİ(Y)** *is.* [*ər.*] *köhn.* Ölmüş bir adamın vəsiyyətini yerinə yetirən. *Çün Səd istədi ki, məsailini soruşsun, həzrət buyurdu ki, .. mənim fərzəndimdən soruş ki, mənim vəsiyyicanişinimdir.* M.F.Axundzadə.

**VƏSİQƏ** *is.* [*ər.*] Bir şeyi təsdiq edən və bir şeyə icazə verən sənəd, rəsmi kağız; şəhadətnamə. [Əbülhəsən bəy:] *Biz küçələrə çıxa bilərdik. Əlimizdə vəsiqələr var idi.* M.S.Ordubadi. *Bəhram məktubu büküb, gərəksiz bir vəsiqə kimi kitabların üstünə tulladı.* Ə.Vəliyev.

**VƏSİQƏLİ** *sif.* Vəsiqəsi, sənədi olan.

**VƏSİLƏ** *is.* [*ər.*] 1. Vasitə, yol, üsul. *Öz ixlas və hüsni-xidmətini* [hər kəs] *bu mətləbin təhsilinə vəsilə bilsin.* M.F.Axundzadə. [Mirzə Məhəmmədqulu:] *.. Bu vəsilə ilə sizləri bəlkə qaranlıq aləmindən çıxarda.* C.Məmmədquluzadə.

2. Vəsait. [Molla Qurban:] *Arvad-uşağı ac saxlamaq olmaz, gərək əldə bir vəsilə olsun.* Ə.Haqverdiyev.

3. Səbəb, bəhanə. *Bu keyfiyyət onun üçün çox yaxşı bir vəsilə göründü ki, onun və sair münəccimlərin guri-pədərini yandırsın.* M.F.Axundzadə. *Naümid bir ricət, bir vəsileyi-qəhr daha çıxdı.* M.Ə.Sabir. *Bu atmacalar generalın danışması üçün bir vəsilə oldu.* Ə.Əbülhəsən. // Fürsət. *Vəsilə axtarmaq.* – *Şərh edəsən ona qəmi-dilimi; Bir vəsilə sala Tanrı, görəsən.* Q.Zakir.

**VƏSİYYƏT** *is.* [*ər.*] Ölərkən bir şəxsin öz övladına, yaxud yaxınlarına verdiyi tapşırıq,

göstəriş, sərəncam, məsləhət, son sözü. [Hacı Xəlil:] *Mənim vəsiyyətim qoca, dünyagörmüş və səni iki gözündən artıq istəyən ata vəsiyyətidir*. Ə.Haqverdiyev. *Xədicə əlavə etdi: – Üçüncü və axırıncı vəsiyyətim də budur ki, məni qəbiristanda basdırmayınız.* S.Hüseyn. ☐ **Vəsiyyət etmək (eləmək)** – ölərkən, yaxud sağ ikən tapşırmaq, sərəncam vermək, məsləhət görmək, son arzusunu bildirmək. [Əbdül:] *Biçarə qız əvvəldən ölməyini yəqin eləmişdi, kağız da yazıb vəsiyyət eləyibdir.* C.Cabbarlı.

**VƏSİYYƏTNAMƏ** *is.* [*ər.* vəsiyyət və *fars.* ...namə] Yazılı vəsiyyət, vəsiyyət kağızı, vəsiyyət sənədi.

**VƏSL** *is.* [*ər.*] *klas*. Sevgilisi ilə qovuşma; vüsal. *Ruzü şəb vəslin xəyalı canda qaldı yadigar*. Xətayi. *Könlüm evi xərabtər oldu fəraqdan; Vəslin bu mülkü etmədi abad, ağlaram.* Natəvan. *Nə üçün verməmişəm vəsl günü canı sənə?* S.Ə.Şirvani. *Mən vəslinə qəlbimdə əzəl gündən əmindim*. S.Rüstəm. ☐ **Vəslə yetmək** – qovuşmaq. *Hər ikimiz vəslə yetək duadan; Hicranın oduna yanmaq nədəndir?* Qurbani.

**VƏSMƏ** *is.* [*ər.*] *köhn.* 1. Möhür.

2. Qadınların qaşlarına çəkdikləri qara boya, rəng. *Vəsmə bol olanda qaşa da yaxarlar, gözə də*. (Ata. sözü). *Qaşa vəsmə, gözə sürmə çəkəndə; Siyah zülfün dal gərdənə tökəndə.* M.P.Vaqif. *Vəsmə nə lazımdır elə bir qaşa; Kəmər gərək incə belə yaraşa*. (Qoşma).

**VƏSMƏLİ** *sif. köhn.* Vəsmə çəkilmiş. *Vəsməli qaş. – Şöleyi-şəmi-hidayətdir cəmalün pərtövü; Qibleyi-mülki-məlaik vəsməli qaşın sənin.* Kişvəri.

**VƏSSƏLAM** [*ər.*] Sözün qısası, məsələ bitdi, iş qurtardı, bu qədər. *Bəli, sözümüz oradadır ki, pişik ilə arvadın çarəsi məhz dağarcıqdır. Sözünə baxmadılar, – qat dağarcığa, ağzını bağla, vəssəlam!* C.Məmmədquluzadə. [Durna:] *Bir atışma başlandı. Əsəd bəyə güllə dəydi, yaralandı, vəssəlam!..* C.Cabbarlı. [Ülfət:] *Nə olsun, – demişdi, – qız xoşuna gəlib, vəssəlam!* Mir Cəlal. // Eyni mənada canlı dildə bəzən *vəssəlam, şüd tamam* şəklində işlənir. [Səfər bəy:] *Mənim adım bəydir, vəssəlam, şüd tamam! Daha artıq danışma*. B.Talıblı.

**VƏSVAS** *is.* [*ər.*] Şeytan, iblis.

**VƏSVƏSƏ** *is.* [*ər.*] Şübhə və tərəddüd, narahatlıq, iztirab, qorxu, səksəkə; əsli olmadığı halda xəyala gələn şey. [Sona:] *Eh, nə vəsvəsələr gəlir könlümə! İnşallah, getməz, mənə and içibdir ki, ..heç bir quzu oğurluğuna da getmərəm.* M.F.Axundzadə. [Seyid:] *Məgər mən gördüyüm röya vəsvəsə imiş, xəyalat imiş?* Ə.Haqverdiyev. *Telli bir saata qədər bir taqım vəsvəsələrlə düşündü.* S.Hüseyn.

**VƏSVƏSƏLİ** *sif.* İztirablı, həyəcanlı, qorxulu, səksəkəli. *Vəsvəsəli yuxu.*

**VƏTƏGƏ** *is.* [*rus*. "ватага" sözündən] Çay, göl və dəniz balıqlarını ovlamaq üçün sahildə yerləşən məntəqə, müəssisə. *Balıq vətəgəsi.*

**VƏTƏGƏÇİ** *is.* 1. *köhn*. Vətəgə sahibi.

2. Vətəgədə işləyən işçi, vətəgə fəhləsi.

**VƏTƏN** *is.* [*ər.*] 1. Bir adamın doğulub böyüdüyü və vətəndaşı olduğu ölkə, məmləkət; doğma yurd, Ana yurd. *Vətəni müdafiə etmək.* // Bir adamın doğulduğu yer. *Şairin vətəni. Nizaminin vətəni Gəncədir*. *– Səndən ötən mənə dəydi; Məndən ötən sənə dəydi; Məndən, səndən ötən zərbə; Vətən, vətən, sənə dəydi...* M.Araz.

2. *məc*. Bir şeyin törədiyi, meydana gəldiyi yer. *Azərbaycan balaca olsa da, böyük ədiblərin, dahi şairlərin vətənidir*. M.Hüseyn. ◊ **Vətən övladı** – xalq, millət, vətəndaşlar. *Əgər xanım qızlar kişi kimi meydana çıxmasalar, vətən övladının gələcəyə arxayın olmağı çətindir.* C.Məmmədquluzadə. *Gözəlləşir günü-gündən həyatı xalqımızın; Həmişəlik vətən övladı bəxtiyar olacaq!* Ə.Vahid.

**VƏTƏNDAŞ** *is.* 1. Müəyyən bir dövlət əhalisinə mənsub olub, öz dövlətinin qanunları ilə müəyyən edilmiş bütün tələbləri yerinə yetirməyə borclu olan şəxs. *Azərbaycan vətəndaşı. – Ey bahar ölkəmin vətəndaşları! Yol açın şəfəqdən hörülmüş nəslə*. A.Şaiq. *Bir balaca Vətən daşı; Vətən daşı olmayandan; olmaz ölkə vətəndaşı...* M.Araz. // Bir dövlətin təbəəsi. *O hansı ölkənin vətəndaşıdır?*

2. Yaşlı adam, kişi. *Bir vətəndaş gəlmişdi. Bu vətəndaş kimdir? – Darvazanın qapısında bir-iki nəfər vətəndaş durub, bir qulluqçu ilə nəsə danışırlar.* C.Məmmədquluzadə. // Yaşlı adamlara rəsmi müraciət forması. *Vətəndaş, vəsiqənizi göstərin! Vətəndaş, yol verin, keçim!*

◊ **Vətəndaş müharibəsi** – bir dövlət daxilində antaqonist siniflər arasında silahlı mübarizə.

**VƏTƏNDAŞLIQ** *is.* 1. Bir şəxsin müəyyən dövlətin vətəndaşları arasında olması; vətəndaşın hüquqi vəziyyəti.

2. *Sif. mənasında*. Həqiqi vətəndaşa aid və xas olan. *Vətəndaşlıq borcu. Vətəndaşlıq vəzifəsi.*

◊ **Vətəndaşlıq hüququ** – hər bir vətəndaşın adi hüquqları. *Sanki* [Murad] *vətəndaşlıq hüququnu itirmiş, yaşamaq istedadını qeyb etmişdi.* S.Hüseyn. **Vətəndaşlıq hüququ qazanmaq (almaq)** – hamı tərəfindən qəbul edilmək, mənimsənilmək; geniş yayılmaq. *Bu söz hələ vətəndaşlıq hüququ almamışdır.*

**VƏTƏNLİ** *sif.* Vətəni, yurdu olan.

**VƏTƏNPƏRƏST** b a x **vətənpərvər**.

**VƏTƏNPƏRƏSTLİK** b a x **vətənpərvərlik**.

**VƏTƏNPƏRVƏR** *sif.* [*ər.* vətən və *fars.* ...pərvər] Öz vətənini sevən, öz xalqına və vətəninə sadiq və onların mənafeyi yolunda canından keçməyə hazır olan. *Vətənpərvər şair. Vətənpərvər gənclər. – Vətənpərvər maarifçilər haray qoparır, "vaxt ikən ayılın, sonra gec olar!" – deyə qışqırırdılar.* M.İbrahimov. // İs. mənasında. *Mina ürəyində dedi ki, ah! Nə olaydı, hamı böylə vətənpərvər olaydı.* İ.Musabəyov.

**VƏTƏNPƏRVƏRANƏ** [*ər.* vətən və *fars.* pərvəranə] b a x **vətənpərvərcəsinə**. *Bolqar müəllimlərindən cavan bir qız əlinə qırmızı bayraq alıb, şəhərin meydanına çıxdı və vətənpərvəranə nitqlər ilə bolqarları həyəcana gətirdi..* C.Məmmədquluzadə.

**VƏTƏNPƏRVƏRCƏSİNƏ** *zərf* və *sif.* Vətənpərvərə yaraşan, vətənpərvərə layiq bir surətdə. *Vətənpərvərcəsinə hərəkət.*

**VƏTƏNPƏRVƏRLİK** *is.* Vətənpərvərə xas olan sifət; öz vətəninə və xalqına sədaqət və məhəbbət və onun yolunda hər bir fədakarlığa hazır olma. *Ədəbiyyat və incəsənətimizin ən gözəl xüsusiyyətlərindən biri onun yüksək vətənpərvərliyindədir.* İ.Əfəndiyev.

**VƏTƏNSEVƏR** b a x **vətənpərvər**.

**VƏTƏNSEVƏRLİK** b a x **vətənpərvərlik**.

**VƏTƏNSİZ** *sif.* Vətəni olmayan. *Bir Vətən həsrəti – bir ulu nisgil! Vətənsiz yaşamaq – yaşamaq deyil.* B.Vahabzadə.

**VƏTƏR** *is.* [*ər.*] *anat.* Əzələləri sümüklərə bağlayan lent və lövhə şəklində sıx birləşdirici toxumadan ibarət elastik törəmə. *Əzələlərin hər iki ucunda əzələnin özündən daha bərk vətər olur ki, bu vətərlər vasitəsilə əzələlər sümüklərə bağlanır*. "Zoologiya".

**VƏZ** *is.* [*ər.*] 1. Vaizin məsciddə camaata söylədiyi dini məsələlərə aid nəsihətamiz və təbliği sözlər; moizə. *Vəz tamam oldu və axund Molla Rəhim minbərdən aşağı endi.* M.F.Axundzadə. *Molla qabaqca bir uzun vəz başladı.* Ə.Haqverdiyev. *Namaz qurtardıqdan sonra, vaiz minbərə çıxıb vəzə başlayır.* H.Sarabski.

2. *məc. isteh.* Nəsihət, öyüd, göstəriş mənasında. *On altıncı nömrəmizdə Molla Pirqulunun .. etdiyi vəzindən bir neçə söz danışmışıq.* C.Məmmədquluzadə. □ **Vəz etmək (eləmək, vermək)** *isteh.* – nəsihət vermək, öyüd vermək; uzun danışmaq, mətləbi uzatmaq, uzunçuluq etmək. [Vəli:] *Bəsdir, çox vəz vermə, görürsənmi, yuxarıda bir zad qaralır?* M.F.Axundzadə. *Bil ki, balıq qədər qanım soyuqdur; Min vəz eləsən də, mənası yoxdur.* S.Vurğun. **Vəz oxumaq** – b a x **vəz etmək (eləmək, vermək)**. *Vəz oxumaq asandır, əməl etmək çətin.* (Ata. sözü).

**VIĞ, VIĞ-VIĞ** *təql.* b a x **vığıltı**.

**VIĞILDAMA** "Vığıldamaq"dan *f.is.*

**VIĞILDAMAQ** *f.* Vığ-vığ eləmək, vığ-vığ səs çıxarmaq. *Ördək vığıldayır. – Kosa yerdə tərpəndikcə ..* [pişik] *əzilər və vığıldardı.* S.Rəhimov.

**VIĞILTI** *is.* 1. Bəzi quşların çıxardıqları "vığ" səsi. *Ördəyin vığıltısı. – Birdən bir vığıltı eşitdim, ah, mən; Gördüm çapalayır yazıq quşcuğaz...* S.Vurğun.

2. Boğulan adamın və ya heyvanın çıxardığı boğuq səs.

**VIJ** *təql.* b a x **vıjıltı**.

**VIJILDAMA** "Vıjıldamaq"dan *f.is.*

**VIJILDAMAQ** *f.* Vıjıltı səsi çıxarmaq, vıjıltı ilə axmaq.

**VIJILTI** *is.* İti gedən bir şeyin və ya iti axan suyun əmələ gətirdiyi səs. *Çayın vıjıltısı, isti-*

*dən yarpaqlar arasına sığınmış quşcuğazların .. çığırtısı sükutu parçalayırdı.* A.Şaiq.

**VIQ, VIQ-VIQ** *təql.* 1. Körpə uşağın çıxardığı səs. *Yazgül* (*bələyi yırğalayaraq*): *– Nə var, a qoca kişi, vıq-vıq elə, bir görüm.* Ə.Məmmədxanlı.

2. Ördək balasının çıxardığı səs.

**VIQQILDAMA** "Vıqqıldamaq"dan *f.is.*

**VIQQILDAMAQ** *f.* Vıq-vıq səs çıxarmaq.

**VÍMPEL** [*holl.*] Ucu haça kimi ayrılmış dar uzun bayraq. // Ensiz, uzun, yaxud üçbucaq şəklində kiçik bayraq. *Məktəb uşaqları estafetdə fəal iştirak etdiklərinə görə keçici vımpel almışlar.*

**VIŞKÁ** [*rus.* вышка] Neft və s. quyusu qazılacaq yerdə qurulan, yaxud başqa texniki məqsədlər üçün taxtadan, metaldan düzəldilən hündür qüllə; buruq. *Orxan gözlərini vışkanın kəlləsində yanıb-sönən lampalara dikdi.* İ.Məlikzadə.

**VIŞKAQURAŞDIRAN** *is. xüs.* Neft quyuları qazmaq üçün vışka düzəldən fəhlə.

**VIYILDAMA** "Vıyıldamaq"dan *f.is.*

**VIYILDAMAQ** *f.* Vıyıltı səsi çıxarmaq (iti gedən şey haqqında). *Külək vıyıldayır. – Budur şimal yeli qopub guruldar; Sürükləyib buludları, vıyıldar.* A.Səhhət. *Çılğın kimi ruzgar vıyıldar; Qar parçalarını göyə sovurar.* A.Şaiq. *Bu dəmdə tüfəng açıldı və Əhmədin qulağının dibindən bir güllə vıyıldayıb keçdi.* B.Talıblı.

**VIYILDATMA** "Vıyıldatmaq"dan *f.is.*

**VIYILDATMAQ** 1. *icb.* Vıyıltı səsi çıxartdırmaq.

2. *f.* Vıyıltı ilə atmaq, fırlatmaq.

**VIYILTI** *is.* Küləyin, güllənin, çarxın və s.-nin sürətli hərəkətindən hasil olan səs. *Lakin elə o dəqiqə tamam qulağının dibindən keçən güllə vıyıltısı bu yoldaşlarını da onun* [Tapdığın] *yadından çıxardı.* Ə.Əbülhəsən. *Küləyin vıyıltısı qüvvətlənir, ağ evlərin taxtapuşlarını danqıldadır.* S.Rəhimov. *Bir tərəfdən parovozların səsi, digər tərəfdən elektrik qatarlarının vıyıltısı xəstələri narahat edirdi.* Şamilov.

**VIZ, VIZ-VIZ** *təql.* b a x **vızıltı**. *Arılar vızvızla uçuşur.*

◊ **Vız durmaq** *dan.* – dik durmaq, pırtlaşmaq, qarışmaq. *Saçları vız durub.*

**VIZILDAMA** "Vızıldamaq"dan *f.is.*

**VIZILDAMAQ** *is.* Vızıltı səsi çıxarmaq, vız-vız etmək. *Arı vızıldayır. – Hər səhər hələ o, yuxudan durmamış, onun qapısında qraflar və knyazlar arı kimi vızıldayırlar.* İ.Köçərli. // İti sürətlə havanı yarıb keçən şeyin çıxardığı səs. *Arxadan atılan düşmən güllələrinin səsi .. vızıldayır, partlayan minalar bayquş kimi ulayırdı.* Ə.Vəliyev.

**VIZILDAŞMA** "Vızıldaşmaq"dan *f.is.*

**VIZILDAŞMAQ** *qarş.* Hamı birlikdə vızıldamaq (həşərat haqqında). *Arılar qarmaqarışıq halda vızıldaşdılar.* S.Rəhimov.

**VIZILDATMA** "Vızıldatmaq"dan *f.is.*

**VIZILDATMAQ** 1. *icb.* Vızıldamasına səbəb olmaq. *Arıları vızıldatmaq.*

2. *f.* Vızıltı ilə atmaq, fırlatmaq, tullamaq. *Daşı vızıldatdı.* // Tüfəngdən, tapançadan atmaq. *İki güllə vızıldatdı.*

**VIZILTI** *is.* 1. Uçan həşəratın qanadları ilə çıxardığı səs. *Hardansa uçub gəlmiş bal arıları gah yarpızlara qonur, bir müddət dayanıb nə isə axtarır, sonra da vızıltı ilə havaya qalxıb bənövşə rəngli güllərin başına dolanırdı.* İ.Şıxlı.

2. İti sürətlə havanı yarıb keçən şeyin çıxardığı səs. *Daşlar qulağımın dibindən vızıltı ilə keçdi. – Top güllələri gəldikcə başımı əyirdim, vızıltı ilə keçib o yan-bu yana düşürdü.* Ə.Əbülhəsən.

**VİBRÁSİYA** *is.* [*lat.*] Müxtəlif formalı elastik cisimlərin mexaniki rəqsi, titrəyiş.

**VİBRİÓN** [*fr.*] *mikr.* Ucu əyri çöp, yaxud vergül şəklində bakteriya, mikrob. *Düz çöp şəklində olan mikroblara basil, azca əyri* (*vergül şəklində*) *olanlara vibrion deyilir.*

**VİBRİÓZ** *is.* [*lat.*] Qaramal və qoyunlarda təsadüf edilən yoluxucu xəstəlik.

**VİCDAN** *is.* [*ər.*] Öz hərəkəti üçün mənəvi məsuliyyət hissi, təmiz ürək hissi, öz hərəkətlərinin yaxşı və ya pis olduğunu duyma. *Vicdanı təmiz olmaq. – Ürək al qanə dönmüş, Hadiya, hüzni-ümumidən; Bu hüznü bəxş edən kimdir dilü vicdanə, bilməm ki!* M.Hadi. *Vətənin sevməyən insan olmaz; Olsa, ol şəxsdə vicdan olmaz.* A.Səhhət. *Vətən torpağının qəhrəman oğlu; Sənin vicdanın da, qüvvətin də var.* S.Vurğun.

◊ **Vicdan azadlığı** *siyasi* – vətəndaşların istədikləri dinə etiqad etmək, yaxud dindən imtina etmək azadlığı. **Vicdan əzabı çəkmək –** görmüş olduğu bir pis işdə günahkar və ya məsul olduğunu duyaraq, vicdanən narahat olmaq və mənəvi əzab çəkmək. *Atasını artıq sevdiyi üçün bu hirslənməsi də Süleymanın çox vicdan əzabı çəkməsinə səbəb olardı.* B.Talıblı.

**VİCDANƏN** *zərf* [*ər.*] Vicdanca, vicdan cəhətindən, öz hərəkəti üçün mənəvi məsuliyyət hissi ilə, təmiz ürək hissi ilə. *Vicdanən əzab çəkmək. – Deməli, burada yalnız vicdanən məsuliyyət duyan Gəray hərəkət etməli idi*. Ə.Əbülhəsən.

**VİCDANİ** *sif.* [*ər.*] Vicdana mənsub və aid olan. [Məlikə xanım:] *Oğlum, daxili saflıq və vicdani saflıq insan üçün böyük bir vüqardır!* S.Rəhimov.

**VİCDANLI** *sif.* Vicdanı olan, öz iş və hərəkəti üçün mənəvi məsuliyyət hiss edən; ürəyindəki təmiz hiss qüvvətli olan; insaflı. *Həyat vicdanlı və namuslu adamı mübarizlər cərgəsinə çıxarmışdır*. S.Rəhman.

**VİCDANLILIQ** *is.* Vicdanı olma, vicdanla hərəkət etmə, vicdanlı münasibət.

**VİCDANSIZ** *sif.* Vicdanı olmayan, öz hərəkəti üçün cəmiyyət qarşısında mənəvi məsuliyyət hiss etməyən, ürək hissi təmiz olmayan; insafsız. *Vicdansız adam. Vicdansız hərəkət*. – [Sara:] *Əbdül adi bir nökər isə də, sizin kimi vicdansız deyil.* C.Cabbarlı.

**VİCDANSIZCA(SINA)** *zərf* Vicdana uymayan bir tərzdə, insafsızcasına; həyasızcasına. *Vicdansızcasına hərəkət.*

**VİCDANSIZLIQ** *is.* Vicdanı olmama; öz hərəkəti üçün mənəvi məsuliyyət hissinin olmaması; insafsızlıq. *Zənnimcə, xilqətdən daha əvvəl ədalətsizlik və vicdansızlıq yaranmışdır*. C.Cabbarlı. *İslam Tellinin izzətinəfsini ayağı altına alıb xırpalamışdı. Bu bir vicdansızlıqdı*. S.Hüseyn.

**VİCƏ** *dan*. b a x **vicvicə**. *Məni vicə tutdu.*

**VİCƏLƏNDİRMƏ** "Vicələndirmək"dən *f.is.*

**VİCƏLƏNDİRMƏK** *f.* Yüngül üşütmə əmələ gətirmək, vicə gətirmək.

**VİCƏLƏNMƏ** "Vicələnmək"dən *f.is.*

**VİCƏLƏNMƏK** *f.* Bədənində yüngül üşütmə hiss etmək. *O, şübhəli nəzərlərlə içəri girənləri süzüb, əllərini ovuşdurdu və vicələnirmiş kimi: – A bala, o pəncərəni örtün, – dedi.* "Kirpi".

**VİC-VİC** *təql.* Quşların cikkiltisi. *İki yolçu sevimli qırlanğıc; Ötüşür bir budaqda şən:* "*vic-vic!*" A.Şaiq.

**VİCVİCƏ** *is. dan.* Üşütmə. *Canıma vicvicə düşdü.*

**VİDA** *is.* [*ər.*] Görüşüb bir-birindən müvəqqəti və ya həmişəlik ayrılma; xudahafizləşmə, sağollaşma; əlvida. *Hacı təntənəli bir vida ziyafəti düzəltmişdi.* M.S.Ordubadi. *Şükufələnmiş güllər nəsimin dəyməsindən enib-qalxdıqca, Gülsümün vidasına cavabən:* "*Get, Allah səni xoşbəxt eləsin!*" *deyirdilər*. Ə.Haqverdiyev. ☐ **Vida etmək (eləmək)** – 1) görüşüb ayrılmaq, vidalaşmaq, əlvida etmək, xudahafizləşmək, sağollaşmaq. *Xülaseyi-kəlam, vida etdilər; Rahi-Yəmən tutub səhər getdilər.* Q.Zakir. *Göz yumub onlara Azər, köpürən; Gurlayan şəhrə vida etdi həmən.* H.Cavid. *Elm və maarif arzusunda olan Abbasqulu ağa cavan yaşlarında Amsar kəndinə vida edib, təhsil dalınca getdi.* Ə.Sadıq; // məc. mənada. *Gülzara hənuz yetmədən xar; Gül qıldı vidayi-səhni-gülzar.* Füzuli; 2) b a x **həyata vida etmək**. *Qulam müəllimin arzusu o idi ki, yetmiş-səksən yaşına qədər ömür sürsün və bu ömrün hamısını da müəllimliyə sərf etsin, axırıncı dəfə məsum çocuq gözlərinə baxıb vida etsin*. S.Rəhimov. **Həyata vida etmək, vidayi-həyat etmək** – həyatla vidalaşmaq, ölmək. *Dursunun gəncliyinin ən azğın çağında atası Pirverdi bütün sərvətini ona buraxıb həyata vida etdi.* A.Şaiq. – *Çörək! Çörək! – deyərək eyləyir vidayi-həyat; Kömək dilər kimi ətrafını süzər sakit*. C.Cabbarlı.

**VİDALAŞMA** "Vidalaşmaq"dan *f.is.*

**VİDALAŞMAQ** *f.* Görüşüb bir-birindən (həmişəlik, ya müvəqqəti) ayrılmaq; xudahafizləşmək, sağollaşmaq. *Student xanımla vidalaşaraq, iki gündən sonra daşınacağını bildirdi*. Çəmənzəminli. *İkinci zəng vurulduqda miniklər vaqonlara minməyə başladılar. Vidalaşmaq zamanı yetişdi.* B.Talıblı. *Tez ol, sevgilim, tez ol gəl, artıq vidalaşaq*. Ə.Cəmil.

◊ **Həyatla vidalaşmaq** – ölmək. *Axşam küləkləri qarşısında uçub gedən yarpaqlar həyatla vidalaşaraq yoxluğa gedən bir bəxtin vəziyyətini təsdiq edir.* M.S.Ordubadi.

**VÍDEO** *is.* [*lat.*] Televiziya, radiolokasiya siqnalları və başqa mürəkkəb elektrik siqnallarının elektron şüa borusu ekranında təsviri ilə bağlılıq bildirən mürəkkəb sözlərdə önlük. *Videokamera, videomaqnitafon və s.*

**VÍKA** [*lat.*] *bot*. Çölnoxudu; noxudaoxşar yem otu.

**VİKARİ** *is.* [*ing*.] Əvəzedici, əvəz edən, vəkil olunmuş şəxs.

**VÍKİNQ** [*skand*.] Qədim Skandinaviya dəniz döyüşçüsü; dəniz qulduru.

**VÍKONT** [*fr*.] Köhnə Fransada, İngiltərədə və bəzi başqa dövlətlərdə: baron ilə qraf arasında orta zadəgan rütbəsi və bu rütbəyə sahib olan adam.

**VİKTORÍNA** [*lat.*] Biliyin müxtəlif sahələrindən şifahi və ya yazılı sualların cavabını tapma oyunu.

**VİLAYƏT** *is.* [*ər.*] 1. Böyük inzibati ərazi bölgüsü. *Dağlıq Qarabağ Muxtar Vilayəti.*

2. Ölkə, məmləkət, mahal, əyalət, ərazi, yer. *Buna görə mən .. müxtəlif dövrlərdə Şirvan, Dağıstan vilayətləri və ətrafında baş verən hadisələri toplayaraq, bir kitab yazmağa başladım.* A.Bakıxanov. *Qarabağ xanı İbrahim xan Şuşa qalasını tərk edərək, Car vilayətinə çəkildi.* Mirzə Adıgözəlbəy. *Bunlar İran əhli idilər, öz vilayətlərində məişətləri məşəqqət ilə keçdiyinə görə, vətənlərini buraxıb buraya gəlmişdilər.* S.S.Axundov.

**VİLAYƏTİ** *is.* [*ər.*] *mus*. Azərbaycan klassik muğamlarının bəzilərinin tərkibində olan əsas şöbələrdən birinin adı. "*Vilayəti*"*nin birinci cümləsi variasiya şəklində təkrar olunmasını tələb edir*. Ü.Hacıbəyov.

**VÍLLA** [*lat.*] Şəhər kənarında bağ-bağat içərisində qəşəng ev; köşk. *Burada çox gözəl villalar tikilmiş, həyətlər, bağçalar səliqəyə salınmışdır.* M.İbrahimov.

**VİNEQRET** *is.* [*fr.*] 1. Kartof, kələm, çuğundur, yumurta və sirkə ilə hazırlanan soyuq yemək; qəlyanaltı yeməyi.

2. Həftəbecər.

**VİNETKA** *is.* [*fr.*] Orta və ya ali məktəbi qutaranların fərdi şəkillərdən ibarət kollektiv şəkli.

**VİNİL** *is.* Kimyəvi maddə.

**VİNT** [*rus.*] 1. Burğulu mıx, burğu şəklində olan mıx. *Vintlə bərkitmək. Vinti boşaltmaq.* // *dan*. Ümumiyyətlə, yivli şeylər: şurup, bolt və s. [Məmməd:] *Bir kranı və ya vinti burmaqda kompressorların və ya motorların işini nizama salırlar.* C.Cabbarlı.

2. Gəmi, yaxud təyyarəni hərəkətə gətirən mexanizmin fırlanan vala bənd edilmiş burğu şəkilli hissəsi; pər, pərvanə.

◊ **(Bir) vinti çatmır** *dan*. – gic, ağlı çatışmayan adam haqqında. **Vintini burmaq** *dan*. – 1) işə salmaq. [Səfər bəy:] *Yaxşı! Yaxşı! Axund, bu Qənbərqulu maşın kimi bir şeydir, bir kərə ki, vintini burdun, .. danışacaq*. B.Talıblı; 2) bir az çəkmək, yığışdırmaq, qabağını almaq.

**VİNTAÇAN, VİNTBURAN** *is.* Vinti burub bərkitmək və ya açmaq üçün alət. *Bıçağın üç-dörd tiyəsi, qayçısı, dırnaqtutanı, konservaçanı, vintburanı, tıxac çıxardanı vardı*. M.Hüseyn.

**VİNTLƏMƏ** "Vintləmək"dən *f.is.*

**VİNTLƏMƏK** *f.* Vintlə bərkitmək, vintlə bir şeyi başqa şeyə rəbt etmək.

**VİNTLƏNMƏ** "Vintlənmək"dən *f.is.*

**VİNTLƏNMƏK** *məch*. Vintlə bərkidilmək.

**VİNTLƏNMİŞ** *f.sif.* Vintlə bərkidilmiş. *Döşəməyə vintlənmiş skamya*.

**VİNTLİ** *sif.* 1. Bərkitmək üçün vinti olan.

2. Vintlə bərkidilmiş, vintlənmiş.

3. *xüs*. Vintlə təchiz edilmiş (b a x **vint** 2-ci mənada). *Vintli təyyarələr dövründən sonra reaktiv təyyarələr dövrü gəlmişdir.*

**VİNTVARİ** *sif.* Vintə oxşayan, vintşəkilli, vint kimi, burğuya oxşayan. *Minarənin yuxarısına çıxmaq üçün tikilmiş daş pilləkən vintvari şəkildə olub, qüllənin içərisində yerləşmişdir.* O.Salamzadə.

**VİÓLA** [*ital*.] *mus*. 1. XV-XVIII əsrlərdə Qərbi Avropada yayılmış müxtəlif ölçü və diapazonlu, yayla çalınan, adətən altısimli musiqi aləti.

2. Yayla çalınan dördsimli musiqi aləti; alt.

**VİOLONÇÉL** [*ital*.] *mus*. Skripka tipində düzəldilmiş yayla çalınan bastenor diapazonlu dördsimli musiqi aləti. *Daşıdığı adından bəlli olduğu kimi, simli orkestrin tərkibi yalnız simli musiqi alətlərindən* (*skripka, alt, violonçel və kontrabas*) *ibarətdir.* Ə.Bədəlbəyli.

**VİOLONÇELÇALAN, VİOLONÇELÇİ** *is.* Violonçel çalan çalğıçı.

**VİRÁJ** *is.* [*fr.*] 1. Döngə.

2. Təyyarənin üfüqi müstəvidə pilotaj fiquru.

3. Fotoqrafiyada pozitiv fototəsvirlərə rəng verilməsi üçün istifadə olunan məhlul.

**VİRAN** *sif.* [*fars.*] Uçuq, yıxıq, dağılmış; viranə qalmış; bərbad. *Viran şəhər. Viran ev. Viran ölkə. – Açdı mənə dərdli ağac; Viran bağın məlalını.* M.Rahim. ☐ **Viran qalsın (olsun)!** – dağılsın! məhv olsun! (*qarğış*). *Zülm əliylə məni yada verirlər; Viran qalsın belə zamana, – dedi.* Aşıq Ələsgər. **Viran qoymaq** – dağıtmaq, uçurtmaq, bərbad hala qoymaq, xarabazara döndərmək. *Zaman-zaman bir div kimi köksümüzə çökdü onlar; Yurdumuzu, yuvamızı viran qoyub sökdü onlar.* M.Müşfiq. **Viran etmək** – 1) dağıtmaq, uçurtmaq, yıxmaq, alt-üst etmək, bərbad bir hala salmaq, pozmaq, korlamaq. *Şamaxıda pristav Cəbrayılov sahibsiz və fəqir bir müsəlman övrətinin evini viran etdi.* C.Məmmədquluzadə; 2) məc. mənada. *Dilbəra, dərdi-dilimdən belə ünvan etdim; Ki, qəmi-hicrdə dil mülkünü viran etdim.* Natəvan. *Məcnun oldum, düşdüm çölə; Könlümü viran elədin.* Aşıq Əsəd. **Viran olmaq (qalmaq)** – dağılmaq, uçulmaq, bərbad olmaq, xarabalığa dönmək. *Tamam aləm viran olsa, qəmim yox; Tək canan mənimlə ittifaq olsun.* Q.Zakir. // *məc. klas*. Kədərli, məhzun, təsəllisiz. *Vaqifəm, olmuşam zülfə giriftar; Könlüm viran, halım xarab, günüm zar.* M.P.Vaqif.

**VİRANEDİCİ** *sif.* Viranə halına salan, yıxıb-dağıdıcı, xarabazara çevirən. *Viranedici müharibələr. Viranedici zəlzələ.*

**VİRANƏ** *is.* [*fars.*] Xaraba, yıxıq bina, uçuq bina qalıqları. *Mənzil olur gəh mənə viranələr; Cin görürəm, can görürəm, qorxmuram.* M.Ə.Sabir. *Mən onda bildim ki, yaranmaq nədir? Bəşərsiz kainat bir viranədir*. S.Vurğun. // *klas*. Məc. mənada. *Xeyli müddətdir ki, könlüm eşq ilə viranədir; İmdi ol viranəni abad qılsan, vaxtıdır*. Xətayi.

**VİRANƏLƏNMƏK** *f.* Viranə halına gəlmək, dağılmaq, bərbad olmaq. // Məc. mənada. *Bir qəmzəsi qanlı, həramı, yağı; Çapdı könlüm şəhrin, viranələnmiş.* M.V.Vidadi.

**VİRANƏLİK** *is.* Xarabazar yer, viran olmuş yer; xarabalıq, xarabazarlıq.

**VİRANXANA** *is.* [*fars.*] Xaraba, viranə, xaraba qalmış ev (hiddət, yaxud kədər məqamında evə işarədir). [Qarı:] *Öz viranxananda otur, .. bu il taxılımız da yaxşıdı.* M.Hüseyn.

**VİRD** *is.* [*ər.*] Dindarların bir savab iş kimi tez-tez söylədikləri, təkrar etdikləri dini kəlam, söz, ifadə. *Gər vəfa qıl bu Xətayi bəndənə, ya qılma, kim; Ruzü şəb verdim sənə zikrü duadır, bilmiş ol.* Xətayi. *Əhli-dünyayə virdi lənətdir; Gecə-gündüz xəyalı dövlətdir.* S.Ə.Şirvani. *Aç dilini, yum gözünü, zahida; Vird oxu, heç anlama mənasını.* M.Ə.Sabir. ☐ **Vird etmək (eləmək)** – bir söz və ya kəlməni tez-tez təkrar etmək, daim söyləmək, dilinin əzbəri etmək. *Məşədi Hacı əlində təsbeh dodaqları dua vird edir.* C.Məmmədquluzadə. *Canamaz üstündə kəsilmiş taqəti; Vird etmək adəti*. M.Müşfiq. *Bu sözləri Səfər vird eləmişdi.* S.Rəhimov.

**VİRTUÁL** *sif.* [*ing.*] 1. Fakta əsaslanan, həqiqi, gerçək.

2. Mümkün olan, imkan daxilində, müəyyən şəraitdə meydana çıxa bilən.

3. Xəyali, əsli olmayan.

**VİRTUÓZ** [*ital.*] *mus.* Öz sənətinin texnikasına mükəmməl yiyələnmiş mahir ifaçı (çalğıçı və ya müğənni). // *dan*. Hər hansı bir işdə ən böyük məharət qazanmış adam; mahir usta. *Çayı dəmləməkdə, bir ovcuna beş-altı armudu stəkan stola gətirməkdə o qədər məharət qazanıb ki, biz onun adını virtuoz çayçı qoymuşuq*. S.Rəhman.

**VİRTUOZLUQ** *is. mus*. Ustadlıq, mahirlik, məharət, mahir sənətkarlıq. *Skripka çalmaqda virtuozluq göstərdi*.

**VÍRUS** *is.* [*lat.*] İnsan və bitkilərdə yoluxucu xəstəlik törədən mikrob.

**VÍSKİ** *is.* [*ing.*] Tünd spirtli ingilis içkisi.

**VİSKÓZ** [*lat.*] 1. Süni lif, sellafon və s. hazırlamaq üçün işlədilən sellülozdan alınan üzvi maddə.

2. Süni ipək. // *sif.* Süni ipəkdən hazırlanmış, tikilmiş. *Viskoz köynək. Viskoz jaket. Viskoz parça*.

**VİSKOZLU** *sif.* Viskoz qarışığı olan.

**VİSMUNDÍR** [*xar.*] İnqilabdan əvvəlki Rusiyada: məmurların geydiyi rəsmi paltar,

frak. [Maslennikov] *üstdən vismundir geyinmişdi.* Tolstoydan. *Neva prospektində birdənbirə bahar olur; buranı yaşıl vismundir geymiş məmurlar bürüyür*. Qoqoldan.

**VİŞ** *is.* Nazik bərk ip.

**VİŞNƏ** *is.* [*rus.*] Albalı, gilənar. *Vişnə mürəbbəsi.*

**VİTALÍST** [*fr.*] 1. Vitalizm tərəfdarı.

2. Vitalizmə aid olan.

**VİTALÍZM** [*fr.*] Biologiyada: həyat prosesləri və hadisələrinin maddi əsaslardan deyil, orqanizmlərdə olan xüsusi qeyri-maddi əsasdan – "həyati qüvvədən" asılı olduğunu iddia edən mürtəce idealist cərəyan.

**VİTAMÍN** [*lat.*] 1. İnsan və heyvanın qidalanması, maddələr mübadiləsi və orqanizmin normal fəaliyyəti üçün lazım olan müxtəlif tərkibli üzvi maddə. *Polşa alimi Kazimir Funk həyat üçün zəruri olan maddələri vitaminlər adlandırmışdır* – "*vita*" *latınca həyat,* "*amin*" *isə atomlu birləşmə deməkdir*.

2. Tərkibində bu cür maddə olan preparat. "*A*" *vitamini.* "*E*" *vitamini.*

**VİTAMİNLƏŞDİRİLMƏ** "Vitaminləşdirilmək"dən *f.is.*

**VİTAMİNLƏŞDİRİLMƏK** *məch*. Vitamin daxil edilmək, vitamin qatılmaq.

**VİTAMİNLƏŞDİRİLMİŞ** *f.sif.* Vitamin daxil edilmiş, vitamin qatılmış, vitaminli. *Vitaminləşdirilmiş balıq yağı*.

**VİTAMİNLƏŞDİRMƏ** "Vitaminləşdirmək"dən *f.is.*

**VİTAMİNLƏŞDİRMƏK** *f.* Vitamin daxil etmək, vitamin qatmaq.

**VİTAMİNLİ** *sif.* Tərkibində vitamin maddəsi olan. *Vitaminli yeməklər. Vitaminli göyərtilər. Vitaminli sabun.*

**VİTAMİNSİZ** *sif.* Tərkibində vitamin olmayan.

**VİTAMİNSİZLİK** *is.* Yeyintidə vitaminlərin olmaması, ya çatışmaması. *Vitaminsizlik xəstəliyi.*

**VİTRÍN** [*fr.*] Malları və ya müxtəlif şeyləri nümayiş etdirmək üçün mağaza pəncərəsinin dalında sərgi yeri, yaxud şüşə ilə örtülü şkaf, yeşik və s. *Laçın iki aydan bəri görmədiyi qəsəbənin ayrı-ayrı evlərinə, dükanların xırda-xuruşla bəzənmiş vitrinlərinə baxa-baxa gedirdi.* M.Hüseyn. ..*Məktəblilər vitrinlərin qabağında dayanıb baxır, kitabların üstünü oxuyur, bir-birinə göstərirdilər.* Mir Cəlal. *Böyük dükanların vitrinləri, divarlar, hasarlar afişa, elan və reklamlarla dolu idi.* S.Rəhman.

**vitse**... [*lat.*] Mürəkkəb sözlərin əvvəlində: müavin, köməkçi mənasında olan hissəcik; məs.: vitse-prezident, vitse-konsul. *İrəvanda da, deyirlər, vitse-konsulun köməkçisi biletin birinə düşəndə on manat alır*. C.Məmmədquluzadə.

**VİTSE-ADMİRAL** Hərbi donanmada: ikinci admiral rütbəsi.

**VİVÁÇE** *zərf* [*ital.*] *mus*. Lap tez, çox iti templə.

**VİVÁRİ** *is.* [*lat.*] Təcrübədə istifadə olunmaq üçün müxtəlif heyvanlar, əsasən laboratoriya heyvanları saxlanan bina.

**VÍZA** [*lat.*] *rəs*. 1. Bir xarici ölkəyə daxil olmaq, orada yaşamaq, yaxud oradan getmək üçün xarici pasportda edilən xüsusi qeyd, rəsmi icazə. *Viza almaq. Viza vermək. – Miss Hannanın pasportunu Culfa jandarm polkovniki Ştraub viza etmişdi*. M.S.Ordubadi.

2. Rəsmi vəzifə sahibinin, hər hansı bir kağız üzərində onun məzmunu ilə razı olduğunu göstərən qeydi. *Viza qoymaq. Müdir öz vizasını qoydu.*

**VİZALAMA** "Vizalamaq"dan *f.is.*

**VİZALAMAQ** *f. rəs*. Viza qoymaq (b a x **viza**).

**VİZALANMAQ** *məch*. *rəs*. Viza qoyulmaq (b a x **viza**). *Pasportlar vizalanmışdır.*

**VİZALATMAQ** *f. rəs.* Viza qoydurmaq (b a x **viza**).

**VİZÍT** [*fr.*] 1. Görüş. [Əbdürrəhman bəy:] *Elə şeyləri sən özün yaxşı bilirsən, gərək o gəlsin vizitə, yoxsa mən gedim ona deyim?* N.Vəzirov. [Həsən ağa:] *Necə, nə üçün məktəb qurtarıbdır, ağsaqqala gərəkdirmi bir vizit versinlər?* Ə.Haqverdiyev.

2. Həkimin xəstə yanına gəlməsi.

**VİZİTKÁ** [*rus*. əsli *fr.*] *köhn*. Qabaq tərəfdən bir-birindən aralı duran yarımdairə şəkilli uzun ətəkləri olan birbortlu sürtuk (kişi paltarı). *Vizitkaların ətəkləri qartal qanadları kimi sağa və sola dönürdü.* M.S.Ordubadi.

**VİZUÁL** *sif.* [*lat.*] Gözlə və ya aparatla görünən.

**VODEVÍL** [*fr.*] Əksərən birpərdəli gülməli pyes.

**VODEVİLÇİ** *is.* Vodevil yazan yazıçı.

**VOJ** [*rus.* вожжи sözündən] Uzun cilov qolları; qoşqu atını və atları sürmək üçün cilovla birləşdirilmiş uzun qayışlar. – *Qoşa qəmər atlarımın vojlarını aldım əlimə.* C.Məmmədquluzadə.

**VOKÁL** *sif.* [*lat.*] Səsə aid olan, oxumaqla ifa edilən, oxumağa aid olan, oxunmaq üçün yazılmış. *Vokal musiqi. Vokal əsər. Konservatoriyanın vokal sinfi.* – *Vəznsiz musiqiyə bunlar daxildir: ladlar üzərində vokal və çalğı gəzişməsi* (*improvizasiyası*). Ü.Hacıbəyov. *Böyük Azərbaycan şairi Nizaminin qəzəlləri də vokal lirika yaratmaq işində Azərbaycan kompozitorları üçün gözəl ilham mənbəyi olmuşdur.* Ə.Bədəlbəyli.

**VOKALÍST** [*lat.*] *mus.* Müğənni yetişdirən mütəxəssis, səs mütəxəssisi. // Xüsusi təhsil almış müğənni.

**VOKALÍZM** [*lat.*] *dilç.* Bir dilin səssizlər sistemi, onların xüsusiyyətləri və bir-birinə münasibəti.

**VOLEYBÓL** [*ing.*] *idm.* İki komandanın topu tor üzərindən bir-birinə atmasından ibarət idman oyunu. *Voleybol zehni işdən sonra istirahət etmək üçün ən yaxşı vasitələrdən biridir.*

**VOLEYBOLÇU** *is.* Voleybol oynayan idmançı.

**VOLFRÁM** *xüs. kim.* Ağ-parlaq, çox yüksək hərarətdə əriyən kimyəvi element – metal. *Nadir və aztapılan elementlərdən volfram, molibden, berillium .. və başqaları xüsusi yer tutur və onların yeni yataqlarının tapılması elm və texnikanı çox maraqlandırır.* M.Qaşqay.

**VOLFRAMLI** *sif.* Tərkibində volfram olan. *Volframlı polad. Volframlı boyalar.*

**VÓLOST** [*rus.*] İnqilabdan əvvəlki Rusiyada və rayonlaşmadan əvvəl SSRİ-də qəzanın tərkibinə daxil olan kiçik inzibati-ərazi vahidi. *15 il bir dabana mən bu volostda can qoymuşam.* S.Rəhimov. *Kiçik zabit Prişibeyev, siz volost yüzbaşısı Alyapovu, kəndxuda Yefimovu təhqir etməkdə təqsirləndirilirsiniz.* Çexovdan.

**VOLT** [italyan fiziki Voltanın adından] Elektrik cərəyanı gərginliyinin ölçü vahidi.

◊ **Volt qövsü** *fiz.* – bir-birinə yaxın duran iki elektrondan keçən cərəyanın əmələ gətirdiyi yüksək hərarətli ağ işıqlı qövs.

**VÓLTA** [*xar.*] Yüngül pambıq parça növü.

**VOLTÁJ** [*xar.*] *fiz.* Elektrik dövrəsində volt ilə ifadə olunan gərginliyin köhnə adı.

**VOLTÁMETR** [*xüs.* Volt və *yun.* metr] *fiz.* Elektrik cərəyanı qüvvəsini, onun kimyəvi təsirinə görə ölçmək üçün cihaz.

**VOLT-AMPÉR** *xüs. fiz.* Dəyişən elektrik cərəyanının zahiri qüvvəsinin ölçü vahidi.

**VOLTERÇİ** *is. tar.* Volter tərəfdarı (b a x **volterçilik**); azad düşünən adam, azadfikirli.

**VOLTERÇİLİK** *is. tar.* Din və feodalizm düşməni olan məşhur fransız yazıçısı və mütəfəkkiri Volterin (1694-1778) fəlsəfi görüşləri üzərində qurulmuş dünyagörüşü (XVIII əsrin ikinci yarısında və XIX əsrin əvvəllərində volterçilik adətən tərəqqipərvər maarifçilik və azadfikirlilik mənasında işlənirdi).

**VOLTMÉTR** [*ital. xüs.* Volt və *yun.* metr] *fiz.* Elektrik dövrəsinin iki nöqtəsi arasındakı elektrik cərəyanının gərginliyini ölçmək üçün cihaz. [Yaşar:] *Tanya, sən də voltmetri qur, reostatı işlət.* C.Cabbarlı.

**VOLYÉR** *is.* [*fr.*] Heyvan saxlamaq üçün qəfəs, evcik və heyvanların gəzişməsi üçün topla hasarlanmış meydança.

**VOLYUNTARÍST** [*lat.*] *fəls. psix.* 1. Volyuntarizm tərəfdarı.

2. Volyuntarizmə əsaslanan.

**VOLYUNTARÍZM** [*lat.*] 1. *fəls.* İradənin dünyanın inkişafında əsas rol oynadığını iddia, təbiət və cəmiyyətdə obyektiv qanunauyğunluğu və zəruriyyəti inkar edən mürtəce-idealist fəlsəfi cərəyan.

2. *psix.* Ağlı deyil, iradəni psixik həyatın həlledici amili hesab etmə.

**VOLYÚTA** *is.* [*lat.*] Mərkəzində dairəsi olan spiralşəkilli memarlıq bəzəyi.

**VÓNA** *is.* Koreya Xalq Demokratik Respublikasında pul vahidi.

**VÓTUM** [*lat.*] Səsvermə vasitəsilə qəbul edilən qərar, fikir. ☐ **Etimad,** yaxud **qeyri-etimad votumu** – parlamentin, hökumətin, yaxud onun ayrı-ayrı üzvlərinin – nazirlərin fəaliyyətini bəyənib-bəyənmədiyini səsə qoyma vasitəsilə ifadə etməsi.

**VTULKA** *is.* [*rus.*] 1. *tex.* Çarxların içərisində sürtünməni azaltmaq üçün metal borucuq və halqa.

2. Tıxac.

**VUÁL** *is.* [*fr.*] 1. Nazik daraqlanmış yun, pambıq, yaxud ipək sapdan hazırlanan hamar, şəffaf parça.

2. Örtük, örpək.

**VULKÁN**[1] [*lat.*] Təpəsindəki deşikdən od, qaz püskürən konusşəkilli dağ; yanar dağ. *Palçıq vulkanı. Sönmüş vulkan. – Vulkan hadisələri dedikdə, biz yerin dərin qatlarından yanar odlu maddənin* (*maqmanın*) *yer səthinə çıxmasını nəzərdə tuturuq.* M.Qaşqay. // *məc*. Obrazlı təşbehlərdə. *Xilas et bu dar-ğın qəlbi möhnətdən; Başımda sevdanın vulkanı yanar*. S.Vurğun. [Afət:] *Ürək od püskürən coşqun vulkandır; Vüsala irməyib xeyli zamandır.* M.Rahim. *Ürəyində vulkan kimi nifrət coşan Gülara hara getdiyini, bu axşam harada qalacağını bilmirdi*. Ə.Vəliyev.

**VULKÁN**[2] *is.* [*lat.*] Qədim Roma mifologiyasında od allahı.

**VULKANÍK** *sif.* Vulkandan əmələ gələn, vulkan nəticəsində baş verən, vulkanizm hadisəsi ilə əlaqədar olan. *Vulkanik hadisələr. Vulkanik maddələr* (*lava, qazlar, kül və s.*). *Vulkanik adalar* (*dənizdə vulkan püskürməsi nəticəsində əmələ gəlmiş adalar*). *Vulkanik süxurlar* (*soyumuş püskürtüdən – lavadan əmələ gəlmiş süxurlar*). *Vulkanik zəlzələ* (*vulkanla əlaqədar yer tərpənməsi*).

**VULKANİZÁSİYA** [*lat.*] *xüs*. 1. Materiala daha artıq möhkəmlik vermək üçün kauçuku və quttaperçanı əsasən qaynar halda işləmə üsulu.

2. Xarab olmuş, deşilmiş, zədələnmiş avtomobil, velosiped şinlərini təmiretmə üsulu.

**VULKANİZÁTOR** [*lat.*] *xüs*. Avtomobil, velosiped və s. şinlərini və ümumiyyətlə, kauçukdan qayrılmış şeyləri vulkanizasiya üsulu ilə təmir etmək üçün cihaz.

**VULKANÍZM** [*lat.*] Yer kürəsinin dərinliklərindən qalxan ərgin silikat kütləsinin (maqmanın) hərəkəti ilə əlaqədar olan hadisələrin məcmusu. *Vulkanizm prosesi. – Geologiya elminin vulkanizm haqqında olan bəhsini rus alimləri düzgün yola salmışlar.* M.Qaşqay.

**VULQÁR** *sif.* [əsli *lat.*] 1. Həddən artıq sadələşdirilərək (bəsitləşdirilərək) təhrif edilmiş; bayağı, qaba. □ **Vulqar materializm** – XIX əsrin 50-60-cı illərində Almaniyada meydana gəlmiş xırda burjua fəlsəfi cərəyanı. *Vulqar materialistlər fikrin maddədən törədiyini çox bəsit, qeyri-elmi bir surətdə izah edirdilər*.

2. *dilç*. Qeyri-ədəbi, ədəbi dilə zidd. *Vulqar söz, ifadə.*

**VULQARCASINA** *zərf* Bayağı surətdə, qaba şəkildə.

**VULQARÍZM** [*lat.*] *dilç*. Ədəbi dil normalarına zidd olan qaba (qeyri-ədəbi) söz və ya ifadə.

**VULQARLAŞDIRAN, VULQARLAŞDIRICI** *sif.* Bayağılaşdıran, qabalaşdıran; bir məsələnin, fikrin mənasını təhrif olunacaq dərəcədə sadələşdirən.

**VULQARLAŞDIRILMA** "Vulqarlaşdırılmaq"dan *f.is.*

**VULQARLAŞDIRILMAQ** *məch*. Bayağılaşdırılmaq, qabalaşdırılmaq, mənası təhrif olunacaq dərəcədə sadələşdirilmək.

**VULQARLAŞDIRMAQ** *f.sif.* Bayağılaşdırılmış, qabalaşdırılmış, mənası təhrif olunacaq dərəcədə sadələşdirilmiş.

**VULQARLAŞMA** "Vulqarlaşdırmaq"dan *f.is.*

**VULQARLAŞMAQ** *f.* Bayağılaşmaq, qabalaşmaq.

**VULQARLIQ** *is.* Vulqar şeyin halı; bayağılıq, qabalıq.

**VURAĞAN** *sif.* 1. Buynuzla, yaxud təpiklə vurmaq xasiyyəti olan. *Vurağan inək. Vurağan keçi. Vurağan at.*

2. Sancan. *Piri kişi bir pətəyə çatdıqda dedi: – Bu pətəyin arıları çox vurağandırlar. Bunlardan özünüzü gözləyin*. S.S.Axundov.

**VURAĞANLIQ** *is.* Vurağan heyvanın xasiyyəti.

**VURAN**[1] *is. riyaz*. Vurma əməlində: vurma hasilini almaq üçün bir ədədin digər ədədə neçə dəfə vurulduğunu göstərən ədəd.

**VURAN**[2] *f.sif.* b a x **vurağan** 1-ci mənada. *Vuran öküzə Allah buynuz verməz*. (Ata. sözü).

**VURÇATLASIN** *is. dan*. Qarmaqarışıqlıq, ara qızışma, mərəkə, səs-küy; dava-vuruşma

(adətən bir işin, hadisənin qızışdığını, ən qızğın çağını bildirir). *Bəli, vurçatlasın, çal oynasın, yeddi gün, yeddi gecə toy eyləyib, axırıncı gün İbrahimi gətirib, qatdılar qızın otağına*. (Nağıl). *Vurçatlasının şirin yerində kəndin ağsaqqallarından biri ortaya çıxıb, sağ əlini yuxarı qaldırdı*. "Kirpi".

**VURDURMA** "Vurdurmaq"dan *f.is.*

**VURDURMAQ** "Vurmaq"dan *icb*.

**VURĞU**[1] *is.* 1. Vuruş, zərbə. *Yan alan gəmilərin vurğusundan qorumaq üçün əsasın qabaq hissəsində xüsusi qoruyucu qoyulur*. Quliyev. *Günəş şüalarından düzgün istifadə etmədikdə, dərinin yanması, ümumi əzginlik, Günəş vurğusu kimi hallar baş verə bilər*. Babayev. // Vurma. *Bir əsər yaranır hər düşüncədən; Hər qəlb vuruşunun öz mənası var.* S.Vurğun. *Döyüşlərə çağırır saatların vurğusu*. S.Rüstəm.

2. *dan*. İflic, beyinə qan vurma.

3. *məc*. Afət, bəla. [Nəsib əmi:] *Matməəttəl qalmışam ki, bu nə bəladı, nəzərdi, gözdü, afətdi, vurğudu, qarğışdı, nədi bilmirəm!* Mir Cəlal.

**VURĞU**[2] *is. qram*. Kəlmədə müəyyən səsin (səslinin) ucalması və bunun üçün o səsin və ya hərfin üzərinə qoyulan işarə. *Vurğu işarəsi.*

**VURĞULU** *sif. dilç*. Üzərində vurğu (vurğu işarəsi) olan. *Vurğulu hərf.*

**VURĞUN** *sif.* 1. Vurulmuş, aşiq olmuş, həddindən artıq sevən; məftun. *Zəfər sözünün də vurğunuyam mən; Günəşdən ucadır onun bayrağı!* S.Vurğun. [Aybəniz:] *Elçin Reyhanın vurğunudur, .. mən onların məhəbbətinə mane olmaq istəmirəm.* M.Hüseyn. *Mən də sənin kimi gülə vurğunam*. M.Rahim.

2. *dan*. b a x **vurğu**[1] 2-ci mənada. *Bu böyük itik, bu kədərli faciə.. Atabalaya bir vurğun kimi təsir etdi.* A.Şaiq.

**VURĞUSUZ** *sif. dilç*. Vurğusu olmayan. *Vurğusuz heca.*

**VURĞUSUZLUQ** *is. dilç*. Vurğu olmaması.

**VURHAVUR** 1. *is.* Dava, vuruşma, dalaşma, qarmaqarışıqlıq, səs-küy, qalmaqal. *Kazım gülərək dedi: – Ay Allahqulu, yaxşı ki, yaxamızı bu vurhavurdan qurtardıq.* Çəmənzəminli. *Açıldı bayraqlar, çalında boru; Fələk görməmişdi bu vurhavuru.* Ə.Cavad.

2. *zərf* Fəaliyyətlə, cəhdlə, durmadan, qızğın surətdə. *Çörəkxanadakılar vurhavur işləyir, su tökür, xəmir yoğurur, kürəyə od qoyurdular.* Mir Cəlal.

3. *is. dan*. Təntənə, dəbdəbə, calal mənasında. *Qızı vurhavurla* (z.) *köçürdülər*.

**VURHAY, VURHARAY** *is. dan*. Səs-küy, qalmaqal, vurçatlasın.

**VURMA** 1. "Vurmaq"dan *f.is.*

2. *riyaz*. Hasil almaq üçün bir ədədin başqa bir ədədə, yaxud öz-özünə vurulması. *Vurma əməli. Vurma cədvəli.*

**VURMAQ** *f.* 1. Əli ilə və ya əldə tutulan bir şeylə çırpmaq, zərbə endirmək. *Ağacla vurmaq. Şillə vurmaq. Qamçı ilə vurmaq. Əllərinə vurmaq.* – [İvan bəy:] *Səsini kəs, buyuraram, başına yüz tatarı vurarlar.* N.Vəzirov. *Fərraşlar Məşədi Həsəni yıxıb, ayağına on çubuq vurdular.* Çəmənzəminli. *Əlimdəki dəyənəyimlə iti vura-vura* (z.) *qovdum*. A.Şaiq. // Buynuz, təpik və s. ilə zərbə endirmək. *İnək uşağı vurdu. Onu at vurmuşdur*. // Döymək, kötəkləmək. *Uşağı vurmaq olmaz.*

2. Bir şeylə toxundurmaq. *Qasım kişi çaxmağı daşa vurub, qovu basır çubuğa.* C.Məmmədquluzadə. [Rüstəm:] *Mən yavaşca öküzün boynuna vurub, həyətə döndərdim.* S.Rəhimov. *Eldar Ayazın çiyninə vurdu*. Ə.Məmmədxanlı.

3. Çalmaq, çaxmaq, qaxmaq, soxmaq. *Mıx vurmaq. Paya vurmaq*.

4. Güllə ilə vurub öldürmək. *Ovçular meşədə üç qaban vurdular. – Bir dəfə Tükəzban xala gecə bostandan qayıdırkən tüfəng ilə bir canavar vurub öldürmüşdü*. B.Talıblı. // Bir şeylə vurub yaralamaq. *Quşu ayağından vurmuşlar*. – [Kərbəlayı Rəcəb:] *Arığın nə işi var qoruqda, vuralar qılçası sına*. N.Vəzirov.

5. Atəşə tutmaq, topa tutmaq, gülləyə basmaq. *Sahildən düşmən gəmilərini vurmaq.* ☐ **Vurub salmaq** – güllə və s. zərbəsinin gücü ilə yerə düşməyə məcbur etmək. *Ağacdan almanı vurub salmaq. Zenitçilər düşmən təyyarəsini vurub saldılar.*

6. Bir şeyi sərrast atıb hədəfə toxundurmaq, dəydirmək. *Nişanı vurmaq. Nə qədər atdımsa, hədəfi vura bilmədim.*

7. Dayamaq, dirəmək, qoymaq, söykətmək. *Divara dayaq vurmaq. Ağaca dəstək vurmaq.*

8. Taxmaq, keçirmək, bağlamaq. *Atın ayağına cidar vurmaq. – Səlim bəy Nəbinin ayaqlarına qandal vurub, Gorus qazamatına göndərir.* "Qaçaq Nəbi". [Gilə] *içəri girib, qapını örtdü və sürməsini vurdu.* Ə.Vəliyev.

9. Yükləmək, yığmaq, çatmaq, doldurmaq. *Arabaya* (*maşına, gəmiyə*) *yük vurmaq, tay vurmaq. – Çıx minbərə, zahirdə oxu nəql kitabı; Buğdanı vur anbara, elə meyl şərabı.* M.Ə.Sabir.

10. Taqqıldatmaq, döymək. *Qapını vurmaq. Darvazanı vurmaq. – Hələ şam yeməyi hazır olmadan, iki qız bir də anası qapını vurub içəri girdilər.* M.S.Ordubadi. // Döyəcləmək, çalmaq. *Nağara vurmaq. Dəf vurmaq.* // *t-siz.* Zərbə və ya başqa bir səslə bildirmək, xəbər vermək. *Telefonun zəngi vurdu. Saat 12-ni vurdu.*

11. Xarab etmək, məhv etmək, zədələmək, zərər vermək. *Almaları dolu vurdu. Əkinləri don vurdu. Meyvələri şaxta vurmuşdur. – Şaxta vurmayacaq göy zəmiləri; Qış gəlib gedəcək bir bahar kimi.* S.Vurğun. |Nəbi:] *Yenə dolu vurdu bizim bağları; Az qaldı ki, düşmən ala dağları.* "Qaçaq Nəbi".

12. *məc.* Bərk təsir etmək. *Saçlarının ətri və bədəninin hərarəti Rüstəmi uzaqdan vurur, ruhunu oxşayırdı.* M.İbrahimov. *Kərim bəy qapını açanda ağır və boğucu isti hava onu vurdu.* Mir Cəlal. *Gorus dağının başında Nəbini isti vurur, bir kölgəlik tapıb uzanır.* "Qaçaq Nəbi".

13. *məc. dan.* İçmək (yalnız spirtli içki haqqında). [İsmayıl bəy:] *Günorta əyləşib, gecə yarısınadək vurdunuz, o sənin sağlığına, sən onun.* N.Vəzirov. [Səfər bəy:] *Gəlib Mirzə Turabla araq vursaydım, bundan yaxşı olardı.* B.Talıblı.

14. *dan.* Oğurlamaq, çırpışdırmaq, çalmaq. [Əhməd dedi:] *Sandıqçanı vurmuşam, içi dolu pul.* N.Nərimanov.

15. Sürtmək, çəkmək, yaxmaq. *Pəncərələrə rəng vurmaq. Üzünə pudra vurmaq.*

16. Yapışdırmaq, asmaq. *Divara elan* (*afişa*) *vurmaq. Divara xalça vurmaq.*

17. Yıxmaq, çırpmaq. *Hüseynağa çölə çıxdıqda külək onu yumurlayıb yerə vurdu.* M.İbrahimov.

18. *riyaz.* Artırmaq, zərb etmək. *Beşi ikiyə vurmaq.*

19. "Özünü" sözü ilə – yalandan göstərmək, oxşatmaq. *Özünü dəliliyə, bilməməzliyə, xəstəliyə vurmaq.* – [2-ci əcinnə:] *Özünü vurubsan səfehliyə, xanımın xoşuna gəlib, səni çörəkləyib saxlayır.* Ə.Haqverdiyev. *Nəbi özünü karlığa vurub, ona yaxın gəlməsini əli ilə işarə edir.* "Qaçaq Nəbi".

20. "Özünü", "özlərini", "özümüzü" sözləri ilə – soxulmaq, girmək, bir şeyin içərisinə atılmaq, dalmaq, cummaq, yönəlmək, üz tutmaq. *Özünü sürüyə vurdu. Özlərini meşəyə vurdular.* – [Nəbi:] *Uşaqlar, yerimiz açıqdadı. Zalım uşağı bizi qıracaq, atları minib, özümüzü düşmənin qoşununa vuraq!* "Qaçaq Nəbi". *Eyvaz kişi özünü çaya vurdu.* Ə.Vəliyev.

21. Sancmaq, çalmaq. *İlan vurmaq. Əqrəb vurmaq. – Əziziyəm, qan damar; Arı vurar, qan damar; Kasıblıq adın çəkmə; Ürəyimə qan damar.* (Bayatı.) [Səadət xanım:] *İlan vuran yatar, amma mənim yuxum gəlməz.* N.Vəzirov.

22. Calamaq, aşılamaq. *Peyvənd vurmaq. Aşı vurmaq. – Vurduq ağaclara biz peyvənd, calaq.* Seyidzadə.

23. Kəsmək, kəsib gödəltmək. *Paltarın ətəyindən bir qədər vurmaq. Dəllək saçımı vurdu. Pambıq kollarının başını vurmaq.*

24. *t-siz.* Döyünmək, atmaq, işləmək. *Nəbzi vurmaq. – Yenə də bir vuraydı qəlbimiz gizli-gizli; Sən ey əsmər bənizli!* M.Müşfiq. *Bir soruş gör, heç ürəyim bir gün onsuz vurdumu?* Ə.Cəmil.

25. *t-siz.* Atmaq, fışqırmaq. *Fontan vurmaq. Fəvvarə vurmaq.*

26. Xüsusi cihaz və s. vasitəsilə yeritmək (maye, hava, qaz və s.). *Nasosla su vurmaq. – Həkim iynəni qaynadıb, Tahirin yumşaq ətinə penisillin iynəsi vurdu.* M.Hüseyn.

27. *dan*. Çevirmək, bir vahidi əsas götürərək hesablamaq. *Kağız pulu qızıla vurmaq.*

28. Bir sıra isimlərin yanına gətirilərək, ismin ifadə etdiyi məna ilə əlaqədar mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: dövrə vurmaq, zərər vurmaq, dəm vurmaq, əl vurmaq.

29. "Vurdu" şəklində – birdən, gözlənilmədən. *İki gün çəkmədi, vurdu anam xəstə düşdü*. Mir Cəlal.

30. "Vurub" şəklində – çox-çox geridə buraxıb, ötüb, aşıb. *Trest müharibədən əvvəlki həcmi vurub keçəcəkdir*. Mir Cəlal.

**VURNUXMA** 1. "Vurnuxmaq"dan *f.is.*

2. *is.* Təlaş, təşviş, həyəcan, çaxnaşma. ☐ **Canına vurnuxma salmaq** – qorxuya salmaq. *Bu görülən işlərin hamısı düşmənin canına vurnuxma salmışdı.* Ə.Vəliyev.

**VURNUXMAQ** *f.* 1. Boş-boşuna o tərəf-bu tərəfə getmək; qurdalanmaq, yerində hərəkət etmək, boş-boşuna daim hərəkətdə olmaq, əlləşmək, çalışıb-çapalamaq. *Səhərdən axşamadək vurnuxmaq*. – [Dayım] *sonra yenə bir o tərəf-bu tərəfə vurnuxdu.* C.Məmmədquluzadə. *...Həmişə görərdin ki,* [Əsgər] *ülgücbülövünü xurcuna qoyub, tülənmiş sərçə kimi vurnuxur.* B.Talıblı. *Mahmud indi hospitalın uzun dəhlizində sağa-sola vurnuxur, şəfqət bacısını axtarırdı*. Ə.Əbülhəsən.

2. Təşvişə düşmək, təlaşa düşmək, həyəcana düşmək, nə edəcəyini bilməmək, özünü ora-bura vurmaq. *İndi neçə saat idi ki, əri getmişdi. Gec gəldiyindən, arvad iztiraba düşüb vurnuxurdu.* Ə.Haqverdiyev.

**VUR-TUT** Cəmi, hamısı, ancaq, var-yox. [Şaqqulu:] *Vur-tut səkkiz manat pul var idi*. C.Cabbarlı. [Baxış oğlu Həsənin] *anası isə gözünün yaşını töküb, vur-tut bir dənə balasının əlindən getməsinə ağlayırdı*. B.Talıblı. [İdris] *burada olanda dəstəmizdə iyirmi adam vardı. Ancaq indi vur-tut səkkizi qalıb.* M.Hüseyn.

**VURUB-YIXAN** *sif.* Azğın, qudurğan; şuluqçu, dəcəl, zərər verən (bəzən qoçaq, qorxmaz mənasında da işlənir). *Teymur ağa həm məşhur kefçi, həm də nüfuzlu və vurub-yıxan cavanlardan idi.* M.S.Ordubadi. *Səfər doğrudan da qızların xoşuna gələnlərdən deyildi. Fəqir, başıaşağı bir oğlandı, vurub-yıxan deyildi.* Ə.Haqverdiyev.

**VURUQ** *is. riyaz*. Vurma əməlində: iki və ikidən çox bir-birinə vurulan ədədlərdən biri.

**VURULAN** *is. riyaz*. Hesabda: tam ədədlərin vurulmasında eyni toplanan kimi təkrar edilən ədəd.

**VURULMA¹** "Vurulmaq¹"dan *f.is.*

**VURULMA²** "Vurulmaq²"dan *f.is.*

**VURULMAQ¹** *məch*. 1. Zərbə endirilmək. *Ağac ilə vurulmaq*. // Döyülmək, kötəklənmək.

2. Çalınmaq, qaxılmaq, soxulmaq. *Paya vurulmaq. Taxtaya iki mıx vurulmuşdur.*

3. Güllə ilə vurulub öldürülmək. *Ovda ikicə quş vuruldu. – Üzvlərdən Hacı Mirzə Həsən vuruldu*. M.S.Ordubadi. *Kəndxuda çox qorxaq adamdı. Uryadnikin vurulmağı onu büsbütün haldan çıxarmışdı*. M.Hüseyn. // Güllə ilə və ya başqa bir şeylə vurulub yaralanmaq. *Ceyran ayağından vurulmuşdur.*

4. Dayadılmaq, qoyulmaq, dirədilmək. *Dəstək vurulmaq. Dayaq vurulmaq.*

5. Taxılmaq, keçirilmək, bağlanmaq. *Cidar vurulmaq. Buxov vurulmaq.*

6. Sərrast atılaraq toxundurulmaq, dəydirilmək. *Hədəf vurulmuşdur*. // Güllə və s. ilə zədələnmək. *Vurulan təyyarə qudurmuş it kimi ulaya-ulaya yerə getdi.* Ə.Vəliyev.

7. Yüklənmək, yığılmaq, qoyulmaq, doldurulmaq. *Vaqonlara yük vurulub qurtardı. Maşına iki ton yük vurulmuşdur. Anbarlara on tonlarla buğda vurulub.*

8. Taqqıldadılmaq, döyülmək. *Səhər çay içərkən qapı vuruldu*. M.S.Ordubadi.

9. Çalınmaq, eşidilmək. *Zəng vuruldu. Bir neçə dəqiqə sonra qulluqçu Rüstəmbəyin yanına qonaq gəldiyini xəbər verdi.* Çəmənzəminli. *Üçüncü zəng vurulurdu. Camaat tamaşa zalına axışdı.* S.Rəhman.

10. Sürtülmək, çəkilmək, yaxılmaq. *Qapıya təzə rəng vurulmalıdır*.

11. Yapışdırılmaq, asılmaq, bənd edilmək. *Divarlara elan vurulmuşdur. – Kinoların qabağına nümayiş etdirilən filmlərin şəkilləri vurulmuşdu.* M.İbrahimov. *Qəhvəyi telefon qutusu Miçurinin portretinin düz altından divara vurulmuşdu.* M.Hüseyn.

12. *riyaz*. Artırılmaq, zərb edilmək. *İki beşə neçə dəfə vurulmuşdur? İyirmi ikiyə vurulanda qırx alınır.*

13. Calanmaq, aşılanmaq. *Calaq vurulmaq. Qələm vurulmaq. Aşı vurulmaq.*

14. Kəsilmək, kəsilib gödəldilmək, qısaldılmaq. *Paltonun ətəkləri bir qədər vurulmalıdır*.

15. Cihaz və s. vasitəsilə yeridilmək (maye, hava, qaz və s.). *Balona hava vurulmaq. Nasosla su vurulmaq. İynə vurulmaq*.

16. *dan*. Bir vahid əsas götürülərək hesablanmaq. [Soltan:] *Hədiyyələri hesabladım. Qızıla vurulsa, beş yüz min dinar qiyməti var.* M.Hüseyn.

17. Bir sıra isimlərin yanına gətirilərək ismin ifadə etdiyi məna ilə əlaqədar mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: *yamaq vurulmaq* (*yamaqlanmaq*), *nal vurulmaq* (*nallanmaq*), *əl vurulmaq* (*toxunulmaq*).

**VURULMAQ²** *f.* Bənd olmaq, aşiq olmaq, məftun olmaq, həddindən artıq sevmək. *Qazamat qulluqçularından birisi Həcərə vurulur.* "Qaçaq Nəbi". [Əsgər] *isə Züleyxanın sərv qamətinə vurulmuşdu*. C.Cabbarlı. *Can, usta, mən bir çəlik yay kimi qurulmuşam; Ürəkdən ahugözlü bir qıza vurulmuşam*. M.Müşfiq.

**VURUM** *is.* Sərrast vurma. *Ağalıq verimlədir, igidlik vurumla*. (Ata. sözü).

**VURUŞ** *is.* 1. Vuruşma; dava, müharibə, döyüş. *Qılınc vuruşundan, güllə səsindən; Yuvadakı quşlar uçhauç oldu.* (Qoşma). *Vuruş meydanında vuruşmağa çıx.* S.Vurğun.

2. Vurma tərzi, zərbə. *Vuruşun kor vuruşuna oxşamır*. (Ata. sözü).

3. Vurma, tıqqıltı. [Turxan bəy:] *Bu saatın hər vuruşu həyatımız üçün ən müdhiş bir zərbə deməkdir*. H.Cavid. *Qələm əldə ilhamını dinlərkən; Sən qəlbimin vuruşundan yarandın.* Ə.Cavad.

**VURUŞAN** *f.sif.* Döyüşən, savaşan, dalaşan, çarpışan, dava edən. *Düşmənlə vuruşan qoşun*. // İs. mənasında. *Vuruşanları aralamaq. – Ofiser gördü ki, dava yaman qızışıb, bunların heç birinin vecinə gəlmir, əmr* [etdi] *ki, vuruşanları gülləyə bassınlar.* H.Sarabski.

**VURUŞDURMA** "Vuruşdurmaq"dan *f.is.*

**VURUŞDURMAQ** *icb*. Bir-birinin üzərinə salışdırmaq, savaşdırmaq, aralarına dava salmaq. *Dostları vuruşdurmaq*.

**VURUŞQAN** *sif.* Çox vuruşan, döyüşən, savaşqan; vuruşmağı, savaşmağı sevən. *Vuruşqan uşaq.*

**VURUŞMA** 1. *is.* Döyüş, çarpışma, dava, savaş, savaşma. *Fəxrəddinlə turanlıların vuruşmaları bir saatdan artıq çəkdi.* M.S.Ordubadi. *Vuruşa zamanı hər iki tərəf böyük tələfat vermiş*(*di*). A.Şaiq. *Bu vuruşmalarda ən çox əzab-əziyyət çəkən, ölən zəhmətkeş adamlar olurdu*. S.S.Axundov.

2. "Vuruşmaq"dan *f.is.*

**VURUŞMAQ** *f.* 1. Döyüşmək, savaşmaq, çarpışmaq. *Düşmənlə vuruşmaq. – Gəl indi cəbhəyə, yoldaş olaq biz; Bir cüt aslan kimi vuruşaq qoşa*. S.Vurğun.

2. Dalaşmaq, kötəkləşmək, bir-birini vurmaq (yumruqla, ağacla və s. ilə).

3. *məc*. Bir şey uğrunda mübarizə etmək, bir şeyi əldə etməyə ciddiyyətlə çalışmaq. *Bol məhsul uğrunda vuruşmaq*.

4. *məc*. Mübahisə etmək, höcətləşmək, bəhsləşmək. *Mollayev savadlı adamlarla vuruşanda daha amansız olurdu*. M.Hüseyn.

**VÜCUD** *is.* [*ər.*] 1. Olma, varlıq, mövcud olma, var olma. *Bəs bunların vücudu nəyə lazımdır!* M.F.Axundzadə. *Kəndlilər onun* [Xəlilin] *vücudunu özləri üçün bir nemət bilirdilər.* S.Hüseyn. ☐ **Vücuda gəlmək** – əmələ gəlmək, meydana gəlmək, ortaya çıxmaq, törəmək. *Hüsnün kitabətindən gəldi vücudə aləm*. Nəsimi. [Əhməd] *bu uzun müddət içində Bakıda nə kimi bir dəyişiklik vücuda gəldiyini görmək, bilmək istəyirdi.* A.Şaiq. **Vücuda gətirmək** – yaratmaq, törətmək, meydana gətirmək.

2. Cisim, bədən, orqanizm. [Fəxrəddin:] *Yox, o deyil, mənim sevgilimin boyu bundan daha ucadır, vücudu daha böyük tənasübə malikdir.* M.S.Ordubadi. [Qadının] *qarabuğdayı üzündə bir dirilik, yanaqlarında vücudunun sağlamlığından nəşət edən bir qırmızılıq .. mövcuddur.* S.Hüseyn. *Vücudun möhkəm olması döyüşçü üçün mühüm şərtdir*. Mir Cəlal.

3. Adam, şəxs. *Amma mən elə başa düşmədim ki, bu yavuqlarda vəfat edən bir vücudun barəsində o qədər çığır-bağır saldılar.* C.Məmmədquluzadə. *Məşədi Səttar dedi: – Bu da bir tühaf vücuddur.* Ə.Haqverdiyev. *Gözümün qarşısında mələk qədər məsum bir vücud od içində yanır.* S.Hüseyn. [Səfər bəy:] *A kişi, Mirzə Turab, sənə kişi kimi söz deyirəm, siz iki qardaşsınız, ikiniz də alim vücudsunuz.* B.Talıblı.

**VÜCUDLU** *sif.* Bədənli, gövdəli, cüssəli, əndamlı. *Qız ucaboylu, sağlam vücudlu, sarısaçlı bir rus qızı idi.* M.S.Ordubadi. *Qasım ağa qalxıb qapıya çatmamış, qələmkar pərdə qaldırıldı, içəri ortaboylu, dolğun vücudlu gözəl bir qadın girdi.* Çəmənzəminli. *Rəisi onu* [Rzanı] *uzunboylu, təqribən səkkiz put ağırlığında dolğun vücudlu bir ağaya təqdim etdi.* M.İbrahimov.

**VÜCUDNAMƏ** *is.* [*ər.* vücud və *fars.* ...namə] Folklorda: insanın doğulduğu gündən son gününə qədər keçirdiyi həyatın ayrı-ayrı mərhələlərini əks etdirən aşıq şeri forması. *Vücudnamənin ən gözəl nümunəsini Aşıq Bozalqanlı vermişdir.*

**VÜKƏLA** [*ər.* "vəkil" sözünün cəmi] *köhn.* Vəkillər.

**VÜQAR** *is.* [*ər.*] Öz heysiyyətini, mənliyini yüksək tutma, mühafizə etmə; təmkin, ağırlıq, ciddiyyət, başıucalıq. *Qartalgözlü Əmirxanın baxışlarında; Bir kişilik, bir də vüqar oxuyur gəlin.* S.Vurğun. [Qəhrəman:] *Onlar nə qədər həyəcanlı olsalar da, özlərini yaxşı saxlayır və vüqar göstərirdilər.* H.Nəzərli. // *məc.* Əzəmət, böyüklük. *Pozmamışdır vüqarını nə qasırğa, nə tufan.* S.Rüstəm. *Bir vüqar duyaraq onun səsində; Yer-göy alqışladı bu qəhrəmanı.* M.Rahim. *Bu heykəlin vüqarı bölüyə aşkar olduqca, qəribə təsir edirdi.* Ə.Əbülhəsən.

**vüqarla** *zərf* Əzəmətlə, başını dik tutaraq, təmkinlə. *Bir qaya başına qartal qonaraq; Dayanmış yenə də sakit vüqarla!* S.Vurğun. *Rüstəm .. bir dilək üçün heç kəsin qabağında qəddini əymir, vüqarla öz əlinə baxırdı.* S.Rəhimov. // *məc.* İftixarla. *Dünya gözəlləşir, dəyişir aləm; Ömür yollarını vüqarla keçdim.* B.Vahabzadə.

**VÜQARLI** *sif.* Öz heysiyyətini, mənliyini qoruyan; təmkinli, təşəxxüslü, ağır, başıuca, məğrur. *Vüqarlı adam. – Baş-başa çatılmış bu qoca dağlar; Vüqarlı qəlbimtək bu uca dağlar.* S.Vurğun. [Möhsün müəllim:] *Necə ola bilər ki, o vüqarlı müəllim, 300 uşağın qayğıkeş mənəvi atası, bu ətrafın yanan çırağı birdən-birə sönsün?* S.Rəhimov. // Zərf mənasında. *Özünü vüqarlı tutmaq.*

**VÜQARLILIQ** *is.* Təmkinlilik, ağırlıq, ciddilik, öz mənlik və heysiyyətini uca tutma, qoruma; başıucalıq. *Maral ayağa qalxanda Qara kişi onun vüqarlılıq verən dəriyaxalı qara drap paltosuna nəzər yetirdi.* Əbülhəsən.

**VÜQARSIZ** *sif.* Vüqarı olmayan, vüqardan məhrum; heysiyyətsiz. *Vüqarsız adam.*

**VÜQARSIZLIQ** *is.* Vüqarı, heysiyyəti olmama; heysiyyətsizlik.

**VÜQU** [*ər.*] *köhn.* Vaqe olma, baş vermə. *Hadisati-mütənəvviənin vüquundan sonra, Məhəmməd şah Səfəvi səltənəti öz oğlu Şah Abbasi-Əvvələ təslim etdi.* M.F.Axundzadə. *Bir qadın da .. ətrafında vüqu bulan hər bir şeyə gözaltı baxıb diqqət yetirirdi.* B.Talıblı.

**VÜQUAT** [*ər.* "vüqu" sözünün cəmi] Vaqe olan hadisələr.

**VÜQUF** *is.* [*ər.*] 1. Xəbərdar olma, bilmə. 2. Durma, duruş.

**VÜRUD** *is.* [*ər.*] *köhn.* Varid olma, gəlmə, yetişmə, çatma, varma. *İrana əvvəl vüruddan Xəlilin zəkavəti, çapıqlığı, ayıqlığı Ağahüseyni təəccübə gətirdi.* Ə.Haqverdiyev.

**VÜSAL** *is.* [*ər.*] *şair.* Görüşmə, qovuşma; sevgilisinə çatma. *Ey Füzuli, kəsmə ol məhvəş vüsalından ümid.* Füzuli. *İstər vüsalını Vidadi xəstə; Üz xakə fərş elər, düaya düşər.* M.V.Vidadi. *Dərmansız dərdimə bulunmaz çarə; Müyəssər olmasa vüsalın, Pəri.* Mirzə Həsən. [Ənvər:] *Milyonlarca gənclərin min bir həsrət və intizarla gözlədiyi vüsalın sağlığına!* Mir Cəlal. ☐ **Vüsalə yetmək (çatmaq)** – sevgilisinə qovuşmaq, istədiyinə qovuşmaq, nail olmaq. *Vüsalə yetməz əlim, zarü natəvan, ölürəm.* Natəvan.

**VÜSƏT** *is.* [*ər.*] Genişlik. *Girdman məmləkətinin iki hökmdarı bəsləyəcək qədər vüsəti vardır.* M.S.Ordubadi. // Məc. mənada. *İnsanın fikir və xəyalının vüsəti qarşısında*

*yeni yollar tapmaq heç də çətin iş deyildir*. M.F.Axundzadə.

**VÜSƏTLİ** *sif.* Geniş.

**VÜSƏTLİLİK** *is.* Genişlik. *Qəhrəmanlıq* [surətinə] *xas olan vüsətlilik, Vətən və xalq səadəti yolunda aparılan şanlı mübarizələr kantata əsərlərində çox parlaq surətdə ifadə edilə bilər*. Ə.Bədəlbəyli.

**VÜSLƏT** *is.* [*ər.*] *şair*. Qovuşma; aşiqin öz sevgilisinə qovuşması; vüsal. *Əlbəttə, bular bu şami-firqət; Bir sübh səadət ilə vüslət.* Məsihi. [Əziz bəy:] *İndi ki vüslət zamanı yaxınlaşıb, arzuma çatacaq ümidi ilə xəyalımı xoş edib aram tutmuşam*. M.F.Axundzadə.

**VÜSUQ** *is.* [*ər.*] *klas*. Ürəkdən inanma, möhkəm inam, etibar, xatircəmlik. *Xanın onlara hər xüsusda vüsuqu var idi.* M.F.Axundzadə.

**VÜSUL** *is.* [*ər.*] Çatma, yetişmə, varma. *Şiraz tənbəkisi göndərdim, vüsulundan məni xəbərdar eylə*. M.F.Axundzadə. ☐ **Vüsul olmaq** – çatmaq, yetişmək, varmaq, varid olmaq. [Fəxrəddin:] *Çox yaxşı, tənək çubuqları da ki vüsul oldu*. N.Vəzirov. [Nəcəf bəy:] *Bəradərim Nəcəf! Kağız yazıb Cavadnan göndərmişdin, gəldi, vüsul oldu*. Ə.Haqverdiyev. [Hacı:] *Hacı Kazım Ələmşahova göndərdiyiniz kağız və pul qəpiyinə qədər gəlib vüsul oldu.* S.Rəhimov.

**VÜZƏRA** *is.* [*ər.* “vəzir” söz. cəmi] *köhn*. Vəzirlər. *Və belə güman edirlər ki,* [idarə və] *politika elminin səltənətə əsla lüzumu yoxdur və lüzumu olsa da, onlar və onların vüzərası bu elmi firəngin babasından da yaxşı bilirlər*. M.F.Axundzadə. *Vəqta ki danışdız, vüzəra oldu xəbərdar; Mütləq görəcəklər ki, cibişdanə zərər var*. M.Ə.Sabir.

**VÜZUH** *is.* [*ər.*] *klas*. Aydınlıq, aşkarlıq; şərh və izaha ehtiyacı olmayacaq dərəcədə aydınlıq (b a x **vazehlik**). *Mirzə Əbdüllətif Təsuci farsi dilində pakizə və nəhayət vüzuh və cövdətdə tərcümə edibdir*. M.F.Axundzadə.

**VZVOD** [*rus.*] *hərb*. Rota, eskadron və ya topçu bölməsi və bu cür bölməni təşkil edən əsgər dəstəsi. *Vzvod komandiri. – Hacıyev Kəyan .. vzvoda yaxınlaşdı*. Ə.Əbülhəsən. *Fərhadın vzvodu xeyli iş görmüşdü.* Ə.Vəliyev.

# Yy

**Y** Azərbaycan əlifbasının otuz birinci hərfi. Bax **ye**

**YA**[1] *bağl.* Bölgü və ehtimal mənalarını bildirir (ya da, ya da ki, ya ki variantları da vardır). *Ya təmə kəs həyat zövqündən; Ya ləbiləli-dilsitandan keç.* Füzuli. *Ya buyur cəllada, ya çəkdir dara; Ya yetir dərmana, üzün bürümə!* Aşıq Ələsgər. *Bunu da ərz edirik ki, .. məktubu Hacı Məcid əfəndi ya özü yazıb, ya öz yavuq adamlarının birinə yazdırıb..* C.Məmmədquluzadə.

**YA**[2] *nida* [*ər.*] Xitab bildirir. *Ya qismət! Ya mədəd! – Qədək aldım yaxalıq; Gəldi düşdü bahalıq; Can üzüb, yar sevmişəm; Sən kömək ol, ya xalıq!* (Bayatı). *Ver muradın bu Vaqifin, ya sənəm!* M.P.Vaqif. [Əsgər:] *Gəl, Əsgər, ya qismət de, bunu al!* Ü.Hacıbəyov.

**YABA** *is.* Ot, saman və başqa bu kimi şeyləri toplayıb atmaq, qaldırmaq, habelə başqa işlər üçün uzun saplı, iki və yaxud daha da artıq dişi olan kənd təsərrüfat aləti. *Dəmir yaba. – Bostana girən porsuq yabanı qəbul eylər.* (Ata. sözü). [Bəxtiyar] *..özünə bir yaba da ala biləcəkdi.* S.Hüseyn. *Qızların, oğlanların, qoca və qadınların .. əlindəki dəyənəklər, taxta qırıqları, yabalar, bellər işə düşdü.* M.Hüseyn. // Rəqəmlərlə – yabanın götürə biləcəyi miqdarı bildirir. *İki yaba ot. – Yeganə giriş yoluna* [Əlləzoğlu] *qəsdən su buraxıb, bir yaba tikan qoyubmuş ki, cuvar adlaya bilməsin.* İ.Hüseynov.

◊ **Yaba ilə dovğa içmək** – faydası, səmərəsi olmayan işlə məşğul olmaq.

**YABACIQ** *is.* Balaca yaba.

**YABALAMA** "Yabalamaq"dan *f.is.*

**YABALAMAQ** *f.* 1. Yaba ilə otu, samanı və s.-ni götürüb bir yerə yığmaq, toplamaq, yaxud atmaq.

2. Yaba ilə vurmaq.

**YABALANMA** "Yabalanmaq"dan *f.is.*

**YABALANMAQ** *məch.* Yaba ilə qaldırılmaq, toplanmaq, atılmaq.

**YABALAŞMA** "Yabalaşmaq"dan *f.is.*

**YABALAŞMAQ** *qarş.* Yaba ilə bir-birini vurmaq; dalaşmaq. *Şərti şumda kəs, xırmanda yabalaşma.* (Ata. sözü).

**YABALATMA** "Yabalatmaq"dan *f.is.*

**YABALATMAQ** *icb.* Yaba ilə yığdırmaq, atdırmaq, qaldırmaq.

**YABALI** *sif.* Yabası olan, əlində yaba tutmuş. *Belli, dəhrəli, yabalı, külünglü, kürəkli adamlar bir-birinə qarışmışdılar.* Ə.Vəliyev.

**YABALIQ** *is.* Yabanın götürə bildiyi miqdar (adətən rəqəmlərlə). *İki yabalıq ot.*

**YABAN** *is.* [*fars.*] Çöl, biyaban, insan yaşamayan yer. *..Yabana hürən köpəklərin xırxırı, hürüşü kəsmə-kəsmə eşidilirdi.* S.M.Qənizadə.

◊ **Ağzını yabana qoymaq** – boş-boş, hərzə-hərzə danışmaq, ağzına gələni danışmaq. **Sözüm yabana** – söhbət əsnasında "sözüm sənə dəyməsin", "sözüm sənə aid deyil" mənasında deyilən ifadə. *Sözüm yabana, arvadım qəzetləri gətirdi: aldım, baxdım.* C.Məmmədquluzadə.

**YABANÇI** *sif.* Özgə, yad. *Yabançı adam. Yabançı ölkələr. – Ərində yabançı qadın iyini duyduğu zaman Maya çılğıncasına vuruşmaq, çarpışmaq istədi.* M.İbrahimov. [Sultan:] *Bilmirsən ki, hansı yabançı təsirlə belə* [cavanlar] *pozulurlar, qabaqlarında gözəl, günəşli bir yol dura-dura, nə üçün avantüraçılıq eləyirlər?!* İ.Hüseynov. // Tanış olmayan, aşna olmayan. [Qoca Baxşı:] *Oxuya bilməzsən, çünki bu hərflər artıq sənə yabançıdır.* C.Cabbarlı. // İs. mənasında. *Vətənin zindanı isə yabançıların sarayından şərəflidir.* M.S.Ordubadi.

**YABANÇILIQ** *is.* Yadlıq, özgəlik; yabançı adamın halı.

**YABANI** *sif.* 1. Çöldə özbaşına bitən; vəhşi. *Yabanı bitki. Yabanı çiçək. – Sən sevgili vətənciyimin gül fidanısan; Sən bir gözəlcə qönçəsən, amma yabanısan.* A.Səhhət. // Cır. *Yabanı meyvə. Yabanı armud.*

2. Əhliləşməmiş, vəhşi, yırtıcı. *Yabanı pişik. Yabanı keçi.*

**YABANILAŞMA** "Yabanılaşmaq"dan *f.is.*

**YABANILAŞMAQ** *f.* Vəhşiləşmək, yabanı hala düşmək; cırlaşmaq. [Çinar] *Azərbaycanda yabanılaşmış şəkildə Zəngilan rayonunda, Bəsitçay ətrafında yayılmışdır və bəzək məqsədi ilə küçələrdə, yolların kənarında və s.-də becərilir.* H.Qədirov.

**YABI** *is.* 1. Arıq, əldən düşmüş, yaraşıqsız at. *Dərviş yabısı hər evin yolunu tanıyar*. (Ata. sözü). *Qurbanəli bəy atını və Kərbəlayı Qasım yabısını minib düşdülər yola.* C.Məmmədquluzadə. *Kəhər olmasın, lap yabı olsun, mollaya bir at vacib idi.* Mir Cəlal.

2. *məc. vulq.* Arıq, sısqa, yeriyə bilməyən adam haqqında.

**YABILAŞMA** "Yabılaşmaq"dan *f.is.*

**YABILAŞMAQ** *f. dan. vulq.* Arıqlayıb qocalmaq, əldən düşmək.

**YABILIQ** *is.* Yabı halına düşmüş atın halı.

**YAD**[1] *sif.* 1. Qohum olmayan, qohumluq və ya yaxınlıq əlaqələri ilə bağlı olmayan; özgə, kənar. *Yad uşaqlar. Özünü yad adam kimi hiss etmək. – Bir gün kişi diqqət eləyib görür ki, övrəti gündüzlər ayağına corab geymir, .. yad kişilərin də yanında ayaqları çılpaq dolanır.* C.Məmmədquluzadə. // İs. mənasında. *Yadlar buna nə deyərlər? Yadları özünə güldürmə! – Bağrımı yandırdın oda; Sirr sözümü vermə yada.* Aşıq Ələsgər. *Taleyim belədir. Xalqın yeddi arxa yadları ağzını açanda tərif tökür... Mənim .. doğma atam ayağımdan çəkir*. Mir Cəlal.

2. Öz vətəni, yeri olmayan; yabançı. *Yad şəhər. – Yad ölkədi, düşmən çoxdu; Ərəb atı mən istərəm*. "Koroğlu". [Sona] *Sən bu yad yerdə, yad adamın yanına niyə gəlibsən?!* M.F.Axundzadə. *Rüxsarə tənha olaraq bu qaranlıq vaxtda bu yad evə göndərildiyinin mənasını özünə aydın edə bilmirdi*. S.Rəhimov.

3. Ruhca, mahiyyətcə, görüşcə uzaq olan, zidd olan, hər hansı bir səbəbə görə yaxın ola bilməyən; yabançı. *Bizə yad görüşlər. – İsmayılzadə təbiətən, diplomatik hiylələrə yad bir adamdı.* M.Hüseyn. ☐ **Yad olmaq** – təbiətinə, xasiyyətinə uyğun olmamaq, uzaq olmaq, heç bir münasibəti olmamaq. *Mənə heç vaxt yad olmadı; Sevinciniz, qəminiz; Xəyallarla nəfəs alan; Cavanlıq aləminiz.* B.Vahabzadə.

4. *məc.* Düşmən mənasında. *Qəza tutdu, qədər məni budadı; Ağlatdı dostları, güldürdü yadı..* Aşıq Ələsgər. *..Dostun da sirrini yada vermək namərdlikdir.* C.Məmmədquluzadə. *Yadların onda kəsilsin nəfəsi; Bürüsün hər tərəfi nəğmə səsi.* S.Rüstəm.

**YAD**[2] bax **yaddaş**. ☐ **Yad edilmək** – yada salınmaq, anılmaq, xatırlanmaq. **Yad etmək (eləmək)** – yadına salmaq, xatirə gətirmək, anmaq. *Kuyində məhrəm etdi rəqibi səfa ilə; Qəhr ilə etmədi məni həm yad, ağlaram.* X.Natəvan. *Hərdənbir ana dilini danışmaq ilə keçmişdəki gözəl günləri yad etməyin nə eybi var?* C.Məmmədquluzadə. **Yad olunmaq** – xatırlanılmaq, yada salınmaq, anılmaq. **Yad(ın)da saxlamaq (tutmaq)** – unutmamaq, daim xatırlamaq, hafizəsində saxlamaq. *Bir şair sözünü yadında saxla; Bil ki, bu dünyada hünər qalacaq*. S.Vurğun. **Yada düşmək** – hafizədə, yaddaşda yenidən canlanmaq, xatirə gəlmək; xatırlanmaq. *Ac yadına düşməz, hər kim tox olur*. Q.Zakir. *Fikr etdikcə cümlə bir-bir keçənləri; Yadə düşər, yanar ciyər, ağlaram*. M.V.Vidadi. *Bayaq fikirləşdiyim sözlərin heç biri yadıma düşmədi.* M.Hüseyn. **Yada gəlmək** – bax **yada düşmək**. *..Elə bir məqam və elə bir iş yadıma gəlmir ki, müsəlman intelligentləri orada qorxaqlıq büruzə verələr.* C.Məmmədquluzadə. **Yada salmaq (gətirmək)** – hafizədə, yaddaşda canlandırmaq, xatirə gətirmək. *Keçmişi yada salmaq. – Gedirəm, gəl ötür piyada məni; Qəlbində unutma, sal yada məni.* Molla Cümə. **Yaddan çıxmaq** – hafizədən, yaddaşdan silinmək, unudulmaq. **Yadında olmaq** – xatirindən çıxmamaq, yadından çıxmamaq, unudulmamaq. [Çərkəz:] *...Ay Teybə, a qızım, əriştə yadında olsun haa, axşam sizdəyəm.* İ.Məlikzadə. **Yadından çıxmaq** – hafizəsindən silinmək; unutmaq. *Bilmirəm haradan danışmaq istəyirdim, yadımdan çıxdı.* C.Məmmədquluzadə. [Mirzə:] *Çox razıyam sizdən. Üç il bundan qabaq uşaqlar haqqında etdiyiniz yaxşılıq indi də mənim yadımdan çıxmır*. Ə.Haqverdiyev. // **Yadımdadır** şəklində – yadımdan çıxmamışdır, indi də hafizəmdədir, unutmamışam. *..Bu da yadımdadır ki, tayamızın dal tərəfində itimiz yuvaya nisbət bir deşik qayırmışdı*. C.Məmmədquluzadə.

**YADDAŞ** *is.* Bir şeyi zehnində saxlamaq və yenidən təsəvvürdə canlandırmaq qabiliyyəti; hafizə. *Yaddaşı inkişaf etdirmək. Yaddaşı zəifdir. Heç yaddaşım yoxdur.* ☐ **Yaddaş dəftərçəsi** – yaddan çıxmasın deyə, bir

şeyi qeyd etmək üçün kiçik dəftərçə. *İclasda Cəmilənin dediyi misraları; Tapıb yazdı o, dərhal yaddaş dəftərçəsinə.* B.Vahabzadə. **Yaddaş etmək** – yadında saxlamaq, yaxud yadında qalmaq üçün bir yerə qeyd etmək. *Deyilənləri bir dəftərə yaddaş et.* **Yaddaş kitabçası** – içərisində müəyyən bir sahəyə, ixtisasa aid ən vacib məlumat olan kitabça. [Gülşən:] *Yaddaş kitabçasını əlində bərk sıxdı.* Ə.Vəliyev. **Yaddaşından çıxmaq** – yadından çıxmaq, unutmaq. *Çox yuxusuz gecələr sovuşsa da başımdan; Gözlərinin gülüşü çıxmayıb yaddaşımdan.* R.Rza.

**YADDAŞLI** *sif.* Yaddaşı, yaxşı hafizəsi olan. *Yaddaşlı uşaq.*

**YADDAŞLILIQ** *is.* Yaddaşı, yaxşı hafizəsi olma.

**YADDAŞSIZ** *sif.* Yaddaşı, hafizəsi olmayan; unutqan.

**YADDAŞSIZLIQ** *is.* Yaddaşı, hafizəsi olmama; hafizəsizlik.

**YADELLİ** *sif.* Başqa ölkədən, yad ölkədən olan; yabançı. *Yadelli işğalçılar. – Yadelli bir şah doğma yurda çapğına keçdi.* İ.Əfəndiyev. // İs. mənasında. *Guşələr göy gurladır, yer titrədir, sel oynadır; Göndərir yadelliyə imzalı fərman Çarigah.* B.Vahabzadə.

**YADIRĞAMA** "Yadırğamaq"dan *f.is.*

**YADIRĞAMAQ** *f.* Uzun müddət bir şeyi görmədiyi, işlətmədiyi, onunla məşğul olmadığı üçün ona əli yatmamaq; yaddan çıxarmaq, unutmaq, yadlaşmaq. *İlyas çoxdan bəri süngü ilə əvəz etdiyi, bir az da yadırğadığı qələmi barmaqları arasında bərk sıxaraq, sərin şimal axşamının, başlanmaqda olan ağ gecənin alatoran işığında yazırdı.* Mir Cəlal. *Nahaq yerə adam hərbi qulluqdanzaddan yadırğayır.* Ə.Əbülhəsən.

**YADIRĞATMAQ** *icb.* Yadırğamasına səbəb olmaq. *Eldar! ..Atı tamamilə qəsdən yadırğatmısan.* Ə.Məmmədxanlı.

**YADİGAR** *is.* [*fars.*] 1. Xatirə olaraq verilən, saxlanılan, yaxud qalan şey. *Bu kitab sənə bizdən yadigar olsun. – Vaqifin və Vidadinin .. əşar və əbyatları .. gələcək nəsil üçün böyük yadigar məqamındadır.* F.Köçərli. [Dul qadın:] [Oğluma] *atadan yadigar olaraq bir bazubənd qalmışdı, qoluna bağlamışam.* Çəmənzəminli. *Babalarımız burada yaşamış, burada ömür sürmüşlər. Bu yurd onlardan bizə yadigar qalmışdır.* Ə.Məmmədxanlı. // Hər hansı bir hadisəni, işi, adamı və s.-ni xatırladacaq, yaxud yada salmaq üçün vasitə olacaq şey. *Şeyx tək otaqda, Gülsümdən yadigar qalan bir pişiyin müsahibəti ilə təbibsiz, dərmansız ömrünün axır saatını gözləyirdi.* Ə.Haqverdiyev. *İndi haman pələng dərisi məndədir. Atamızdan yadigar olduğu üçün saxlayıram.* A.Şaiq.

2. *məc.* Qalıq, nümunə. *Keçmiş dövrlərin yadigarı. – Məşədi Əhməd tamamilə əski həyatın bir yadigarı idi.* S.Hüseyn.

**YADİGARLIQ** *is.* Yadigar qalmağa yarar şey, yadigar verilmiş şey.

**YADLAMA** "Yadlamaq"dan *f.is.*

**YADLAMAQ** *f.* 1. B a x **yadlaşmaq**.

2. Yada salmaq, yad etmək.

3. *məh.* Bir-bir saymaq, sadalamaq. *Və başladı bir-bir yadlamağa: qızıl üzüklər, qaşdaşlar...* C.Məmmədquluzadə.

**YADLANMA** "Yadlanmaq"dan *f.is.*

**YADLANMAQ** b a x **yadlaşmaq**.

**YADLAŞMA** "Yadlaşmaq"dan *f.is.*

**YADLAŞMAQ** *f.* Getdikcə yad olmaq, uzaqlaşmaq; qohumluq və ya yaxınlıq əlaqəsini itirmək.

**YADLIQ** *is.* Yad olma, yabançı olma; yabançılıq.

**YADÖLKƏLİ** *is.* və *sif.* Yadyerli, əcnəbi.

**YADRO** *is.* [*rus.*] *idm.* Yüngül atletika yarışlarında itələməklə tullamaq üçün polad, çuqun və bürüncdən kürəvari alət.

**YADYERLİ** *sif.* Yadelli, qərib, gəlmə.

**YAFƏSİ** *sif.* Yafəslərə aid olan, onlara xas olan. *Yafəsi tayfalar.* □ **Yafəsi dillər** yaxud **yafəs dilləri** – akad. N.Y.Marrın əvvəlcə Qafqaz dillərinin sami və hami dillərinə qohumluğunu göstərmək üçün tətbiq etdiyi, sonralar isə Aralıq dənizi hövzəsi və Ön Asiyanın bütün ölü dillərinə, habelə Pireney və Pamir canlı dillərinə şamil etdiyi dilçilik termini.

**YAFƏS(İ)LƏR** *cəm* [Bibliya əfsanəsinə görə: Nuhun üç oğlundan ən kiçiyinin, dünyadakı tayfaların ulu babası, əcdadı sayılan Yafəsin adından] Qafqazın, Ön Asiyanın, Aralıq dənizi ölkələrinin, Pireneyin bir hissəsində yaşayan, yaxud vaxtilə yaşamış

xalqlar qrupunun şərti adı (bu xalqlar qrupuna bəzi qədim tayfalar, habelə indiki xalqlar: abxazlar, basklar, gürcülər, çərkəzlər və b. daxildir).

**YAĞ** *is.* 1. Ev heyvanlarının südündən hasil edilən, asan əriyən, yeyilən və xörək bişirmək üçün işlədilən maddə. *Şit yağ* (*kərə*). *Ərinmiş yağ. Camış yağı. Sarı yağ* (*ərinmiş yağ*). *İnək yağı. – Yağdan sonra düyü tədarükünün dalına düşürlər, çünki plov düyüsüz olmaz.* C.Məmmədquluzadə. *Hamımız süfrə başına oturub qatıq, yağ, qaymaqdan doyunca yedik.* A.Şaiq. *Pərşan ocağı alışdırdı, tavaya yağ atdı.* M.İbrahimov.

2. Ətin içində olan ağ və əriyən maddə; piy. *İç yağı. Quyruq yağı.* // Heyvanın dərisi altında qalın bir təbəqə təşkil edən piy maddəsi. *..Yağ əridikcə közün üstünə damcılayıb cızıldayır, seyrək tüstü qalxıb sakit havada yayılır, həyəti kabab iyi bürüyürdü*. İ.Hüseynov.

3. Bəzi bitkilərin tumundan, çiçəyindən və ya meyvələrindən çıxarılan maddə, yağlı maye. *Günəbaxan yağı. Pambıq yağı. Zeytun yağı. Küncüt yağı. Xaşxaş yağı.* // Mineral mənşəli bəzi maddələrdən alınan yağlı maye. *Neft yağı. Maşın yağı.*

4. *tib.* Tərkibində yağ maddəsi olan bəzi dərmanların adı. *Sürtkü yağı.*

5. *məc. dan.* Fayda, xeyir mənasında.

◊ **Balıq yağı** – bəzi dəniz məməlilərindən alınan və müalicə məqsədi ilə işlədilən yağ. *Həkim uşağa balıq yağı yazıb.* **Yağ çıxarmaq (tutmaq)** – südü çalxamaqla yağ hasil etmək. *Arvadların bir qismi maşınla yağ çıxarır, o biri qismi isə südü mayalayıb pendir tuturdu.* İ.Əfəndiyev. **Yağ kimi** *dan.* – asanlıqla, maneəsiz. *Dinləyə-dinləyə* “*oxqay*”*lar deyir; Canına yağ kimi yayılır şeir.* S.Vurğun. **Yağ kimi ürəyinə yatmaq** – çox xoşuna gəlmək, məmnun etmək, ləzzət vermək. *Onun sözləri yağ kimi ürəyimə yatdı. – Bağır ömründə birinci dəfəydi ki, Nurcabbara* “*şair*” *deyirdi və güman eləyirdi ki, bu söz Nurcabbarın ürəyinə sarı yağ kimi yayılmalıdı..* İ.Məlikzadə. **Yağ salmaq** – 1) bişərək yağı çıxmaq. *Quymaq yağ salıb;* 2) *məc.* kökəlmək. **Yağ yaxmacı** – üzərinə yağ sürtülmüş çörək parçası. *Rüstəm bəy bir parça çörək götürüb özünə yağ yaxmacı qayırdı.* Çəmənzəminli. **Yağ zavodu** – süddən yağ və başqa ağartı hazırlayan zavod. **Yağa düşmək** – b a x **yağ salmaq** 1-ci mənada.

**YAĞABƏNZƏR** *sif.* Xüsusiyyətlərinə görə yağa oxşayan, yağ xassələri olan. *Yağabənzər maye.*

**YAĞANLIQ** *is. məh.* Yağıntı. *Payız yağanlıqla girmişdi.* Ə.Vəliyev.

**YAĞAOXŞAR** b a x **yağabənzər**. *Yağaoxşar maddələr.*

**YAĞAR** b a x **yağıntı**.

**YAĞARLIQ** b a x **yağıntılı**. *Düzülmüş damcılar, mirvari kimi; Yağarlıq illərin baharı kimi.* H.K.Sanılı.

**YAĞAYIRAN** *is. xüs.* Tərkibində yağ olan maddəni tərkib hissələrinə ayırmaq və ya onu yağdan təmizləmək üçün cihaz.

**YAĞAYIRICI** *is. tex.* Bəzi maşınlarda yağı ayıran cihaz.

**YAĞ-BAL** *is.* 1. Yağ və bal.

2. *məc.* Çox dadlı, ləzzətli şey haqqında. [Ağsaqqal kişi] *şor-çörək tikəsini orduna basır, yağ-bal kimi şirin-şirin yeyirdi.* Mir Cəlal. *Qəzəb çəlləyinə barıt tökənə; Qələmim yağ-ballıq eləyə bilmir.* M.Araz.

◊ **Yağ-bal içində yaşamaq** – gen-bolluq içində yaşamaq, firavan həyat sürmək.

**YAĞÇALAN** *is. xüs.* Yağ istehsal edən işçi.

**YAĞÇI** *is.* Yağ istehsal edən və ya yağ satan adam.

**YAĞÇILIQ** *is.* Yağ istehsal etmə, yağ istehsalı. *Yağçılıq işi.*

**YAĞDAN** *is.* Yağ qoyulan və ya içərisinə yağ tökülən qab. *Yağdanda yağ yoxdur. – Kəyan bir burda traktorçu Əliyə baxdı: – Ə, yağdanı zibillənmiş traktor kimi orda nə tıshatıs salmısan? Hə!* Ə.Əbülhəsən.

**YAĞDIRILMA** “Yağdırılmaq”dan *f.is.*

**YAĞDIRILMAQ** *məch*. 1. Yağmasına səbəb olmaq, yağmağa, tökülməyə məcbur edilmək. *Süni yağış yağdırılmaq.*

2. Tökülmək (hər tərəfə, çoxlu miqdarda). *Hər yandan meydana allı-güllü ipək yaylıqlar yağdırıldı*. M.Rzaquluzadə.

**YAĞDIRMA** “Yağdırmaq”dan *f.is.*

**YAĞDIRMAQ** *icb.* 1. Yağmağa, tökülməyə məcbur etmək. *Süni yağış yağdırmaq üçün qurğular. Xəzri qar yağdırdı. – Hər dəfə mü-*

*səlmanların müsəllaya çıxmaqları ilə Allah yağış yağdırsa, dəxi bundan sonra bir kəs dəli deyil ki, arx çıxartsın, kəhriz vurdursun.* C.Məmmədquluzadə.

2. Külli miqdarda hər tərəfdən, aravermədən atmaq, tökmək, səpmək, saçmaq. *Güllə yağdırmaq. – Cəfa oxun mənə yağdırman, ancaq ey əflak; Demən ki, yeddi kəmandarə bir nişanə yetər.* Füzuli. // Saçmaq. *Günəş göyün bir qatından od yağdırırdı.* M.Hüseyn. // Qoşulduğu sözün ifadə etdiyi şeyin çoxluğunu, bolluğunu bildirir. *Suallar yağdırmaq. – Şəmsiyyə uzun danışdı, şikayətləndi və Pəhləviyə qarğış yağdırdı.* M.İbrahimov.

**YAĞI** *is.* Düşmən. *Giryan dedi:* "*Ey gözüm çirağı; Vəhşilərə el, mənimlə yağı*". Füzuli. *Ərz eləyim, bu sözümün sağıdır; Yollarınız haramıdır, yağıdır.* M.V.Vidadi. *Bizik kəc yağının döşündən vuran; Azadlıq yolunda keşikçi duran.* S.Vurğun. ☐ **Yağı kəsilmək** – düşmən olmaq. *Çinovniklər rəhm edirmi fağıra; Dostlarım özümə yağı kəsildi.* Aşıq Ələsgər. **Yağısı yarılmaq** – bərk qorxmaq, bağrı yarılmaq. *Pərişan olmasın bari sağımız; Yüyürməkdən saf yarıldı yağımız.* Q.Zakir.

**YAĞILIQ** *is.* Düşmənlik.

**YAĞIN** b a x **yağıntı**. *Üç ay var ki, yağın yoxdur.*

**YAĞINLIQ** 1. *is.* Yağışın çox olması; yağıntı. *Payız çox yağınlıq keçdi. – Bu il yağınlıq olduğundan, otlar vaxtından əvvəl göyərmiş, yazın ilıq nəfəsini duyandan sonra isə püskürüb qalxmışdı*. İ.Şıxlı.

2. *sif.* Yağmurlu, yağışlı. *Maşınlar o yoldan sağa dönməli, sürəti azaltmalı, ..yağınlıq havalarda isə palçığa yapışıb qalmalı olurdular.* Mir Cəlal.

**YAĞINTI** *is.* Yağış, qar, dolu və s. şəklində havadan yerə düşən su qətrələri; yağmur. *Yeraltı suların mənbəyi atmosfer yağıntıları, çay sularıdır.*

**YAĞINTILI** *sif.* Yağıntısı çox olan; yağmurlu. *Yağıntılı il. Yağıntılı yer.*

**YAĞINTILIQ** b a x **yağıntı**. *Bu il yağıntılıqdır.*

**YAĞIOTU** *is. bot.* İriçiçəklilər qrupuna mənsub hündür ot bitkisi.

**YAĞIR** *is.* Bel sümüyünün üstündə əmələ gələn, gec sağalan dərin yara. [Eşşək] *görməyib axurunda hərgiz co; Dalı yağır, dəxi ayağı cido.* S.Ə.Şirvani. [Qurban:] *Hər gün ölə-ölə qayıt, belin olsun yağır.* Ə.Haqverdiyev.

**YAĞIRLANMA** "Yağırlanmaq"dan *f.is.*

**YAĞIRLANMAQ** *f.* Sürtülməkdən yara olmaq.

**YAĞIRLATMA** "Yağırlatmaq"dan *f.is.*

**YAĞIRLATMAQ** *f.* Yara etmək, yara açmaq, yağırlanmasına səbəb olmaq.

**YAĞIRLI** *sif.* Yağırı olan, yarası olan. *Beli yağırlı at.*

**YAĞIŞ** *is.* Xırda su damlaları şəklində atmosfer yağıntısı; yağmur. *Güclü yağış. Yağış yağmaq. Yağış ara vermir. – Yağışın rütubəti səqfin uçan yerindən çəkilməmişdi.* C.Məmmədquluzadə. *Hələ tamam qurumamış yağış gölləri; Üzərində bulud-bulud uçur milçəklər.* S.Vurğun. *Səlim .. yağışa düşmüş bir şəhərliyə bələdçilik etdiyini danışdı.* Mir Cəlal.

◊ **Yağış kimi** – bolluq, çoxluq bildirir. *Tökdü yağış kimi gözündən yaşı; On yeddiyə təzə çatırdı yaşı.* H.K.Sanılı. **Yağışdan çıxıb yağmura düşmək** *məc.* – bir çətin vəziyyətdən və ya hadisədən qurtarıb daha çətin vəziyyətə düşmək.

**YAĞIŞLAMA** "Yağışlamaq"dan *f.is.*

**YAĞIŞLAMAQ** *f.* Yağış yağmağa başlamaq.

**YAĞIŞLI** *sif.* Yağmurlu, yağış yağan, yağış olan. *Yağışlı hava. – Baharı yağışlı olan illərdə; Xalılar döşənib süslü çöllərdə...* H.K.Sanılı. *Yağışlı bir bahar gecəsi idi.* M.Hüseyn. *Yağışlı, soyuq bir gün idi.* S.Rəhman.

**YAĞIŞLIQ** *is.* 1. Yağış, yağmur. *Lənkəran yağışlıq çox olan yerdir.*

2. B a x **yağmurluq** 2-ci mənada.

**YAĞIŞÖLÇƏN** *is. meteor.* Bir yerə yağan yağışın miqdarını ölçmək üçün cihaz.

**YAĞIŞSIZ** *sif.* Yağış olmayan, yağış düşməyən, yağış yağmayan. *Yağışsız yay.* // Zərf mənasında. *Payız yağışsız keçdi.*

**YAĞIŞSIZLIQ** *is.* Yağış olmama, yağış yağmama, yağış düşməmə; yağış, yağmur olmadığı hal, vəziyyət; quraqlıq.

**YAĞQABI** b a x **yağdan**.

**YAĞLAMA** "Yağlamaq"dan *f.is.*

**YAĞLAMAQ** *f.* 1. Üstünə yağ sürtmək, yağ çəkmək. *Çəkməsini yağlamaq. – Bəli, cəlladlar tənabları yağlayıb hazırladılar.* "Koroğlu". *Yüyəni, tapqırı bütün yağladı; Qantırğaya təzə qayış bağladı..* H.K.Sanılı.

2. Yaxşı işləmək və ya paslanmamaq üçün yağ sürtmək, yağla silmək. *Tüfəngi yağlamaq. Maşını yağlamaq.*

3. *məc. dan.* Rüşvət vermək. // Qılığına girməyə çalışmaq, dilə tutmaq.

◊ **Yağlayıb-ballamaq** – yalandan tərif etmək, dilə tutmaq.

**YAĞLANDIRILMA** "Yağlandırılmaq"dan *f.is.*

**YAĞLANDIRILMAQ** *məch.* Yağa batırılmaq, yağ sürtülmək, yağlı edilmək.

**YAĞLANDIRMA** "Yağlandırmaq"dan *f.is.*

**YAĞLANDIRMAQ** *f.* Yağlı etmək, yağa batırmaq, yağa bulaşdırmaq.

**YAĞLANMA** "Yağlanmaq"dan *f.is.*

**YAĞLANMAQ** *f.* 1. Yağ sürtülmək, üzərinə yağ çəkilmək. *Maşınlar yağlanır salınır, işə.* M.Rahim.

2. Yağa batmaq, yağlı olmaq; kirlənmək. *Üst-başı yağlanıb. Paltarın yaxası yağlanıb.*

3. *məc. dan.* Kökəlmək, ətlənmək, piylənmək. *Qovurmalıq üçün saxlanılan bir cüt erkək o qədər yağlanmışdı ki, quyruqlarını çəkib apara bilmirdi.* Ə.Vəliyev.

4. *məc. dan.* Pullanmaq; pullu, varlı olmaq.

◊ **Gün yağlanmaq** *məh.* – Günəşin ən isti vaxtı haqqında. [Ələmdar:] *Mən axşamdan dükanın qabağında, o yastı daşın üstündə öz cırıq çuxama bürünüb yatmışam, bir də gün yağlananda ayılmışam*. S.Rəhimov. *Gün getdikcə yağlanır, qoyun kürnəc bağlayır, köç dəhmərlənib gedirdi*. Ə.Vəliyev.

**YAĞLATMA** "Yağlatmaq"dan *f.is.*

**YAĞLATMAQ** 1. *icb*. Yağ sürtdürmək, yağ çəkdirmək.

2. *f.* Kirlətmək, yağlı etmək, yağa batırmaq. *Üst-başını yağlatmaq.*

**YAĞLAYICI** 1. *is.* Maşınları yağlayan fəhlə. *Yağlayıcı vəzifəsi.*

2. *sif. tex.* Maşınlara yağ tökməyə və ya yağlamağa məxsus. *Yağlayıcı nasos. Yağlayıcı cihaz.*

**YAĞLI** *sif.* 1. Yağı olan, tərkibində yağ çox olan. *Yağlı ət. Yağlı xörək. Yağlı balıq. – Yadın oğlu yağlı aşa mehmandı; Dar gündə baxarsan ki, usandı.* Aşıq Ələsgər. *Ət bazardan daşınıb mənzilə zənbil-zənbil; Etmədi mədələri yağlı qidanı təhlil.* S.Ə.Şirvani. *Axşamın toranında közərib parıldayan kömürün üzərində şişlərə yağlı qabırğalar çəkilmişdi.* İ.Hüseynov. // Tərkibində yağ maddəsi olan. *Yağlı bitkilər.*

2. Yağa bulaşmış. *..Məmməd kişi kababı yeyib yağlı əlləri ilə bığlarını eşdi.* S.Rəhman. // Üzərində yağ ləkəsi olan; kirli, çirkli. *Yağlı əsgiləri yumaq. Köynəyin boynu yağlıdır.*

3. *məc. dan.* Pullu, varlı, gəlirli, yaxşı gəlir mənbəyi olan. *Yağlı yer. – Molla Xəlil düşünürdü: hər üç, beş Quran oxudan Hacı Hüseyn kimi yağlı müştərilər Quranların sayını ixtisara salsalar, o zaman mədaxili birə-üç, birə-dörd azalacaqdır.* S.Hüseyn. *Leylək Ələmdar çovğunun, azanın və zənglərin qatqarış səslərinə qulaq verir, onda yağlı bir qarət həvəsi doğurdu.* S.Rəhimov.

4. *məc. dan.* Kəsərli, tutarlı, təsirli, şiddətli. *Yağlı töhmət aldı. – Cəbhədə dəydimi ona yağlı, tutarlı bir kötək; Atəş alır, quduzlaşır, dörd yanı qapır köpək.* Ə.Nəzmi.

◊ **Yağlı boya** *rəss.* – tərkibində yağ olan rəssam boyası. *Vəzir taxt üstündə oturdu və bir müddət hamamın kəllə divarındakı yağlı boya ilə çəkilmiş əfsanəvi ənqa quşuna baxaraq fikrə getdi*. Ə.Məmmədxanlı. **Yağlı dil** – şirin, lakin yalan sözlər, aldadıcı dil. *Qərəz, o yan-bu yan, Xoca Əziz yağlı dilini işə salıb qoruqçunun hirsini yatırtdı.* "Koroğlu". [Qəhrəman:] *Mən* [xanımın] *hiyləgər və yağlı dilinə qarşı dərin bir nifrət hiss edirdim*. H.Nəzərli. *İndi Leylək .. o yağlı dili tapa bilərdimi?* S.Rəhimov.

**YAĞLICA** 1. *sif.* Çox yağlı, olduqca yağlı. *Yağlıca ət. – Hətta namaz vaxtı da mömin müsəlmanın fikri və zikri dolu olur yaxşıca, yağlıca bozbaş ilə.* C.Məmmədquluzadə.

2. *is. bot.* Gəvən kitrəsi (bitki). *Bəzi yerlərdə gəvən kitrəsini yağlıca da adlandırırlar.* S.Sadıqov.

**YAĞLIXƏMİR** *is.* Xalq təbabətində: yaranın üstünə, yaxud ağrıyan yerə qoymaq üçün yağ ilə yoğrulmuş, yağ qatılmış xəmir. *Kərimin ayağına yağlıxəmir salıb yerə uzadardılar*. H.Sarabski.

**YAĞLI-QARA** *sif.* Yağlı, hisli və kirli; çirkli. // *məc*. Çirkin, kifir. *Onun yağlı-qara çöhrəsi pörtüldü*. Ə.Əbülhəsən.

**YAĞLILIQ** *is.* 1. Yağlı şeyin halı, tərkibində yağ olma. *Ətin yağlılığı. Xörəyin yağlılığı.*

2. Yağa batmış (bulaşmış) şeyin halı; kirlilik.

**YAĞLITƏRƏ** *is.* Tərənin yeyilən növü; tərə.

**YAĞLIVAÇA** *is. məh.* Yanları hündür balaca qulplu tava.

**YAĞLI-YAĞLI** *sif.* 1. Çox yağlı, ləzzətli, dadlı, çox qidalı. *Yağlı-yağlı xörəklər.* – [Hacı Murad:] *Kafir uşaqları kafir, yeyin mənim yağlı-yağlı xörəklərimi.* S.S.Axundov.

2. *məc*. Şirin-şirin. *Koxanın gözü qazanda, yağlı-yağlı söhbətlərdən elədi.* S.Rəhimov. // Zərf mənasında. *Rüstəm dolamalı yollarla mənzil qət etmək üçün yağlı-yağlı danışıb qurtardığı zaman Qəhrəmanı dinləməyə, ondan təzə söz, yeni əhvalat eşitməyə çalışırdı.* S.Rəhimov.

**YAĞMA**[1] "Yağmaq"dan *f.is.*

**YAĞMA**[2] *is.* Soyğun, qarət, soyğunçuluq, talan, çapovul. *Yağma etmək.*

**YAĞMAQ** *f.* 1. Havadan qar, yağış, dolu kimi şeylər düşmək, tökülmək. *Qar yağmaq. Dolu yağmaq. – Havalar gözəl keçirdi, tez-tez yağış yağırdı*. C.Məmmədquluzadə.

2. Çox miqdarda, arası kəsilmədən tökülmək. *Biz şəhərə girdiyimiz zaman şiddətli xəzri əsir, küçələrin tozunu havaya sovurur, göydən başımıza torpaq yağırdı.* A.Şaiq. // *məc*. Bir şeyin çoxluğunu, şiddətini, davamlılığını bildirir. *Üsyançılar qalib gələn kimi bizim olduğumu bu evə yağan güllələrin sayı-hesabı olmayırdı*. H.Nəzərli. *Göydən yerə zülm yağır; Çörək baha, vergi ağır.* S.Vurğun. // Bir şeyin bolluğunu bildirir. □ **Bərəkət yağmaq** – bolluq olmaq, artmaq, çoxalmaq. *Şəms padşaha dua-səna edib xəzinənin üstünə gəldi, açarları alıb işə başladı. Onun vaxtında xəzinənin üstünə gündən-günə bərəkət yağdı*. (Nağıl).

3. *məc. dan.* Bir şeyi ifadə etmək. *Onun üzündən biclik yağır. Sifətindən nur yağır. – Yağır gözlərindən odlu ildırım; Görməmişdi Qozluq belə bir qırım.* H.K.Sanılı. *Hüzn və ciddiyyət yağan çöhrəni bir anda ilıq bir məmnuniyyət ifadəsi qapladı.* M.S.Ordubadi. *Kəsalət yağan vücudunun tərsinə olaraq çox cəld və quş kimi yüngül hərəkət edən ruznaməçi İranpərəst tez qaçıb portfelini gətirdi.* M.İbrahimov.

**YAĞMALAMA** "Yağmalamaq"dan *f.is.*

**YAĞMALAMAQ** *f.* Soymaq, qarət etmək, talamaq. // *məc. şair.* Əlindən almaq, məhrum etmək mənasında. *Səbrimi yağmaladı şövqin, qərarım qalmadı*. Nəsimi. *Xumar-xumar baxmağı gözlərin; Yağmalayıb solusağı gözlərin*. Q.Zakir.

**YAĞMALANMA** "Yağmalanmaq"dan *f.is.*

**YAĞMALANMAQ** *məch*. Qarət edilmək, soyulmaq, qəsb edilmək, zorla əlindən alınmaq.

**YAĞMUR** *is.* Yağış, yağıntı. *Yüngül, sərin meh əsir; Yağmuru birdən kəsir*. A.Səhhət. *Payız mövsümü yaxınlaşdığı üçün havada yağmur olduğundan açıqda bulunan yay binasında heç bir yığıncaq yox idi.* S.Hüseyn. *Yağmur ara verdi, sevinib söylədim: – Ay can! Quştək yeni bir nəğmə uçurtdum dodağımdan.* S.Rüstəm.

**YAĞMURLU** *sif.* Yağışlı. *Yağmurlu hava. Payızın yağmurlu bir günü idi. – Qış mövsümü qayət soyuq, yağmurlu bir havada; Gördü ancaq arvad-uşaq qalmış kənddə, obada*. A.Səhhət.

**YAĞMURLUQ** *is.* 1. Yağışlıq, yağışlı hava. *Bu il çox yağmurluqdur. – Az qalıb, lap az, ancaq buralar yağmurluq olan yerdir, divarları korlaya bilər.* S.Rəhimov.

2. Yağmurdan (yağışdan) qorunmaq üçün geyim; plaş. [Sirat] *evə gəlib silahlandı. Yağmurluğunu aldı*. Ə.Əbülhəsən.

3. Yağış sularının evin divarlarına axıb tökülməməsi üçün damın bir az kənara – aşağıya uzanan hissəsi.

**YAĞMURÖLÇƏN** b a x **yağışölçən**.

**YAĞMURSUZ** *sif.* Yağışsız. *Yağmursuz hava.*

**YAĞMURSUZLUQ** *is.* Yağışsızlıq.

**YAĞÖLÇƏN** *is. xüs.* Südün yağlılıq dərəcəsini ölçmək üçün cihaz.

**YAĞ-PENDİR** *is.* İçərisinə yağ və pendir qoyulmuş lavaş, çörək və s. [Qaraş] *bir az çörək və yağ-pendir bürmələyib yaylığa bağladı*. M.İbrahimov.

**YAĞ-RƏNG** *is. dan.* Yağlı boya. *Evləri yağ-rəng etdirmək.*

**YAĞSIZ** *sif.* 1. Yağı olmayan, yağı az olan; yavan. *Yağsız ət. Yağsız xörək.*

2. Yağ tökülməmiş, yaxud yağ sürtülməmiş. [Fitnə:] *Ölkəsindən tutmaz xəbər; Yağsız çıraq çox tez sönər.* A.Şaiq. [Qarı Mahmuda:] *Qarnın da ki yağsız araba çarxı kimi cırıldayır.* Ə.Əbülhəsən.

**YAĞSIZLANDIRILMA** "Yağsızlandırılmaq"dan *f.is.*

**YAĞSIZLANDIRILMAQ** b a x **yağsızlaşdırılmaq**.

**YAĞSIZLANDIRMA** "Yağsızlandırmaq"dan *f.is.*

**YAĞSIZLANDIRMAQ** b a x **yağsızlaşdırmaq**.

**YAĞSIZLANMA** "Yağsızlanmaq"dan *f.is.*

**YAĞSIZLANMAQ** b a x **yağsızlaşmaq**.

**YAĞSIZLAŞDIRILMA** "Yağsızlaşdırılmaq"dan *f.is.*

**YAĞSIZLAŞDIRILMAQ** *məch.* Yağsız hala salınmaq, yağı çıxarılmaq.

**YAĞSIZLAŞDIRMA** "Yağsızlaşdırmaq"dan *f.is.*

**YAĞSIZLAŞDIRMAQ** *f.* Yağsız etmək, yağsız hala salmaq, yağını çıxartmaq, yağını almaq. *Dərini yağsızlaşdırmaq.*

**YAĞSIZLAŞMA** "Yağsızlaşmaq"dan *f.is.*

**YAĞSIZLAŞMAQ** *f.* Yağsız hala gəlmək, yağı qalmamaq.

**YAĞSIZLIQ** *is.* Yağsız şeyin halı. *Ətin yağsızlığı. Xörəyin yağsızlığı.*

**YAĞTİKAN** *is. bot.* Alçaqboylu tikanlı bitki; dəvətikanı. *Pəncərələrin altında yağtikan bitmişdi.* İ.Hüseynov.

**YAĞTUTAN** b a x **yağyığan**.

**YAĞYIĞAN** *is. xüs.* Südün üzündən yağı yığmaq üçün cihaz; yağtutan.

**YAHU** *nida* [*ər.*] 1. Hey! Ey! Mənə bax! *Yahu, bura bax! Yahu, eşitmirsənmi! – Hərçi dad eylədi çoban, yahu! Eşidənlər dedi: yalandır bu!* M.Ə.Sabir. // Deyilən sözə diqqəti cəlb etmək üçün işlənir. *Cahanda yox elə bir qüvvə baş əyim ona mən; Fəqət nə güclü, zəif bir vücud var, yahu?!* C.Cabbarlı. // Rica, xahiş yerində. *Etməyin, yahu!*

2. *din.* Ya Allah, ay Allah (bəzən təkrar şəklində). ☐ **Yahu demək** *köhn.* – Allahı imdada, çağırmaq, Allaha müraciət etmək. *Neçə padşahlar orda olub cəm; İki dərviş yahu deyir dəmadəm.* Aşıq Ələsgər.

**YAXA** *is.* 1. Paltarın boyun keçən hissəsi, habelə bu hissəyə tikilən və boyunu əhatə edən parça zolağı. *Enli yaxa. Köynək yaxası. Kostyumun yaxası kirlənib. Sırmalı yaxa. – Mina kəmər xub yaraşır belinə; Yaxası qızıldan düymələnibdir.* Aşıq Ələsgər. *Məsum kişi arxalığının yaxasını düymələyə-düymələyə içəri girdi.* Mir Cəlal.

2. B a x **yaxalıq**. *Əlləzoğlu qrafini götürüb yaxasını, dizlərini islada-islada su içdi.* İ.Hüseynov.

3. Sahil, kənar, tərəf. *Paris küçəsində, Nil yaxasında; Yenə al bayraqlı izdihamlar var.* S.Vurğun. *Səs verildi üsyana; Qarşıdakı yaxadan, xəbər gəldi, baxsana; O yanki fabrikadan.* Ə.Cavad.

◊ **Yaxa açmaq** – 1) ölü üçün ağlamaq, yas saxlamaq. [Xortdan:] *Üç gün yaxa açıb təziyədar olur.* Ə.Haqverdiyev; 2) qarğımaq, qarğış etmək. **Yaxa ələ vermək** – b a x **yaxasını ələ vermək**. **Yaxa ələ verməmək** – b a x **yaxasını ələ verməmək**. **Yaxa qurtara bilməmək** – xilas ola bilməmək, canını qurtara bilməmək. *Hətta kəndin ən zəngin qızları və yüzbaşının qızları belə, qadınların bu dediqodusundan, qaş-gözündən yaxa qurtara bilməmişdilər.* C.Cabbarlı. **Yaxa qurtarmaq** – b a x **yaxasını qurtarmaq**. [Kərəmov özözünə:] *Xeyr a!.. Bundan yaxa qurtarmaq çətin olacaq.* S.Rəhman. **Yaxa yırtmaq** – 1) başqası üçün çalışmaq, başqasını haqlı-haqsız müdafiə etmək. *Dost yolunda yaxa yırtdım, baş açdım; Gecə-gündüz dadü bidad eylədim.* (Qoşma); 2) ağlamaq, fəğan etmək. *Yar odur ki, yardan sonra yar üçün; Zülf dağıda, yaxa yırta, yara üz.* Qurbani. *Bizim üçün bəzmü bərat yazanlar; Eşq əlindən yaxa yırtıb ağlaram.* Aşıq Mənzur. **Yaxası əldə qalmaq** – üzərində məsuliyyət qalmaq, məsuliyyətdən qurtara bilməmək. **Yaxası ələ keçmək** – tutulmaq, girə keçmək, yaxalanmaq. *Tülək tərlan kimi havada süzən; Sonra yaxan keçər ələ, pəhləvan!* "Koroğlu". **Yaxası(nı) qurtarmaq** – canı(nı) qurtarmaq, xilas olmaq, qurtulmaq. *Yaxası yaxşı qurtardı. – Nə qədər çalışdımsa, onun əlindən yaxamı qur-*

*tara bilmədim.* M.Hüseyn. **Yaxasına keçmək** – yaxasından yapışmaq, tutub buraxmamaq. *Keçib yaxanıza ölümün əli; Hazırdır fələkin qanlı çəngəli!* H.K.Sanılı. **Yaxasından əl götürmək (əl çəkmək)** – rahat buraxmaq, əl çəkmək, dəyib-toxunmamaq, daha işi olmamaq. [Şamama Cadu:] *A gədə, itil cəhənnəmə, yaxamdan əl götür.* Ə.Haqverdiyev. [Məmmədhəsən əmi arvadına] *Arvad, Allah xatirinə, əl çək mənim yaxamdan.* C.Məmmədquluzadə. **Yaxasından yapışmaq** – 1) yaxalamaq, yapışmaq, tutub buraxmamaq, əl çəkməmək. *..Nə səbəbə avropalılar öz əməllərini kənarda qoyub, bizim yaxamızdan yapışıblar?* C.Məmmədquluzadə. [Oğlan] *gözləyirdi ki, bu saat yaxamdan yapışacaq, kim bilir, nə çətin sual verəcək!* Mir Cəlal; 2) məsuliyyətə çəkmək, cavab istəmək. *Bu qaydanı mən qoymamışam, dəvədən böyük fil var, gedin, onun yaxasından yapışın.* "Kirpi". // **Yaxasından tutmaq** – 1) b a x **yaxasından yapışmaq**; 2) inadla tələb etmək, bir işdən yapışıb əl çəkməmək. [İndiki şairlər] *bir şeyin yaxasını tutub yüz cürə əlfaz və ibarə və istiarələr yolu ilə onu tərif və tövsif etməyə sərfi-hümmət qılırlar.* F.Köçərli. [Əli əmniyyəbaşı mübaşir Məmmədə:] *Nə tutmusan abconun yaxasından. Konyak da var, Şiraz şərabı da!* M.İbrahimov. **Yaxasını buraxmaq** – b a x **yaxasından əl çəkmək**. [Rauf Şeydaya:] *Kağız ələ keçərsə, pək fəna... Həm də Məcid əfəndi əsla yaxanı buraxmaz.* H.Cavid. **Yaxasını ələ vermək** – 1) özünü ələ vermək, tutulmasına, yaxalanmasına imkan vermək, yaxalanmaq, tutulmaq, ehtiyatsızlıq göstərmək; 2) *məc.* birinin tələbləri, xahişi qarşısında yumşaqlıq göstərmək, zəiflik göstərmək, qarşı dura bilməmək, təsir altına düşmək. **Yaxasını ələ verməmək** – özünü ələ verməmək, qaçmaq, yaxın durmamaq, yayınmaq. **Yaxasını qırağa (kənara) çəkmək** – bir işə qarışmamaq, məsuliyyətdən qaçmaq, özünü kənara çəkmək, boyun qaçırmaq, imtina etmək. *Camalın anası əl-ayağını yığışdırıb Cənnət kişigilə elçiliyə getdi. Cənnət kişi yaxasını kənara çəkdi.* S.Rəhimov. *Tahir açıq cavabdan yenə yaxasını kənara çəkdi..* M.Hüseyn. **Yaxasını qurtarmaq** – qurtarmaq, canını qurtarmaq. *Öylə afətdən yaxasın qurtaran olmazmı şad?* Füzuli. [Zeynal] *istəyirdi ki, yaxasını uşaqlardan qurtarıb onları analarına versin.* S.Hüseyn. **Yaxasını tanımaq** – dadanmaq, bir adama daim bir şey üçün müraciət etmək. *Dərd, qara gün yaxasını tanıyan; Biri mənəm, bir də varmı, biləydim.* Molla Cümə.

**YAXABƏND** *is.* Yaxanı bağlayan düymə, ilmək və s. *Açılıb yaxabəndi; Ağ sinəsi qara baxın!* Aşıq Ələsgər.

**YAXAC** b a x **yaxı**. [Müəssisə sahibi:] *Bu qutudakı yaxac atların dırnağı üçündür. Yeni kəşf olunmuş bir şeydir.* Çəmənzəminli.

**YAXALAMA[1]** "Yaxalamaq[1]"dan *f.is.*

**YAXALAMA[2]** "Yaxalamaq[2]"dan *f.is. Qabları yaxalama. Əllərini yaxalama.*

**YAXALAMAQ[1]** *f.* 1. Yaxasından tutmaq, boğazından yapışmaq. *Cəllad Qəməri yaxalayanda vəzir, vəkil və bütün əhli-məclis padşahın ayağına düşüb dedilər: – Şah, qəzəbini söndür!* (Nağıl). *Biz ayı vurulan yerə yetişər-yetişməz itlər ayını yaxaladı.* A.Şaiq.

2. Tutmaq, ələ keçirmək, həbs etmək. *Oğruları yaxaladılar. – Sərdar Rəşidin evindəkilərin hamısını yatdığı yerində yaxaladılar, onların hamısı sərxoş olub yatmışdı.* A.S.Ordubadi.

3. Tapmaq, haqlamaq, tutmaq (gedən yerdə, qaçarkən, uzaqlaşarkən, yaxud bir iş görərkən). *Mehriban mütərəddid idi. Bir istəyirdi ki, Zeynalın ardınca gedib onu Yelizavetanın evində yaxalasın.* S.Hüseyn. // *məc.* Gəlib yetişmək, başının üstünü almaq. *Əcəl onu yaxaladı.* – [Abbas:] *Məmiş, mən altmışı yaxalamışam.* M.Hüseyn. // *məc.* Rast olmaq, rast gəlmək, tuş gəlmək. *Tərs kimi güllə həmişə elə qorxağı yaxalayır.* M.Hüseyn. *Külək* [Giləni] *eyvanda yaxaladı.* Ə.Vəliyev. *Bir dəfə çobanı çöldə yağış yaxalayır.* Ə.Sadıq. // Məc. mənada. *Adamlar Kür çayını elə buradaca yaxalamaq, cilovlamaq qərarına gəlmişlər.*

**YAXALAMAQ[2]** *f.* Təmiz su ilə yumaq, hər tərəfinə su axıtmaq, suya çəkmək. *Əllərini yaxalamaq. Boşqabları yaxalamaq.* – [Qızılquşun] *balaları bir qədər böyüdükdən sonra, ovladığı quşu su kənarına alar, tüklərini yolar, cəmdəyini suda təmiz yaxaladıqdan sonra parçalayıb balalarının qabağına atar.* A.Şaiq.

[Rüstəm:] *A bala, bir o çayniki yaxalayıb dəmlə görək..* M.İbrahimov. *Arvad samovarı çölə çıxartdı, külünü boşaldıb yaxaladı, su töküb kömür saldı.* Ə.Vəliyev.

**YAXALANMA**[1] "Yaxalanmaq[1]"dan *f.is. Caninin yaxalanması.*

**YAXALANMA**[2] "Yaxalanmaq[2]"dan *f.is. Qab-qaşığın yaxalanması.*

**YAXALANMAQ**[1] *məch.* Ələ keçirilmək, tutulmaq, həbs edilmək, yaxası ələ keçmək. *Cinayətkar yaxalandı. – Xain yaxalandı ən nəhayət.* H.Cavid. [Şamogili] *təqib edən olsaydı, tez yaxalana bilərdilər.* S.Rəhimov.

**YAXALANMAQ**[2] *məch.* Təmiz su ilə yuyulmaq, suya çəkilmək. *Qablar yaxalandı.*

**YAXALAŞMA** 1. "Yaxalaşmaq"dan *f.is.*

2. *is.* Dalaşma, dava. *Yaxalaşma başladı.*

**YAXALAŞMAQ** *qarş.* Bir-birinin yaxasından tutub dalaşmaq.

**YAXALATMA**[1] "Yaxalatmaq[1]"dan *f.is.*

**YAXALATMA**[2] "Yaxalatmaq[2]"dan *f.is.*

**YAXALATMAQ**[1] *icb.* Tutdurmaq, həbs etdirmək. [Milyonçular] *bu gün bir üsyançını yaxalatdırır, sabahı o biri inqilabçıya tindalı güllə atdırır, birisi gün baş qaldıran kəndi oda-alova tutdururdular.* S.Rəhimov.

**YAXALATMAQ**[2] *icb.* Yaxalama işi gördürmək (b a x **yaxalamaq**[2]). *Qab-qaşığı yaxalatmaq.*

**YAXALI** *sif.* Yaxası olan. *Rüstəm bəy – rus intelligent libasında: yəni pidjak, jilet, nişastalı yaxalı köynək, boğazında qalstuk...* C.Məmmədquluzadə.

**YAXALIQ** 1. *is.* Geyimin, yaxanı, boğazı, döşü örtən hissəsi. *Yaxalığının üstündən bağladığı qalstuk bütün döşünü örtəcək qədər enli idi.* M.S.Ordubadi.

2. *sif.* Paltar yaxası üçün yararlı, münasib, kifayət edən. *Yaxalıq xəz. Bir yaxalıq dəri.*

**YAXALIQLI** *sif.* Yaxalığı olan. *Təzə uzunboğaz çəkmələrdə, qalife şalvarda və iki döş cibi olan beli kəmərli yaxalıqlı köynəkdə Şirzad yaraşıqlı idi.* M.İbrahimov. [Şamama] *göy dəri yaxalıqlı paltosunun yaxasını açmamış(dı).* Ə.Əbülhəsən.

**YAXALIQSIZ** *sif.* Yaxalığı olmayan. *Yaxalıqsız köynək.*

**YAXANTI** *is. dan.* Yuyulmuş qabın bulanıq, çirkli suyu; qab suyu. *Qab yaxantısı.*

**YAXARMA** "Yaxarmaq"dan *f.is.*

**YAXARMAQ** *f.* Adətən "yalvarmaq" feli ilə birlikdə işlənərək, israrla yalvarmaq mənasını bildirir. [Qoca kəndli:] *Bir xan ki rəiyyəti qaramal kimi qulağından tutub sata, ona nə yalvarmaq, nə yaxarmaq!* Ə.Haqverdiyev. *Göygözlü oğlunu düşmən apardı; Qoca nə yalvardı, nə də yaxardı.* R.Rza.

**YAXASIAÇIQ** *sif.* və *zərf* Döşüaçıq.

**YAXASIZ** *sif.* Yaxası olmayan. *Yaxasız köynək, bacasız dam olmaz.* (Ata. sözü).

**YAXDAN** *is. məh.* Üzünə dəri çəkilmiş ağac qutu; sandıqça, mücrü.

**YAXDIRILMA**[1] "Yaxdırılmaq[1]"dan *f.is.*

**YAXDIRILMA**[2] "Yaxdırılmaq[2]"dan *f.is.*

**YAXDIRILMAQ**[1] *məch.* Üzərinə sürtdürülmək, çəkdirilmək.

**YAXDIRILMAQ**[2] *məch.* Yandırılmaq.

**YAXDIRMA**[1] "Yaxdırmaq[1]"dan *f.is.*

**YAXDIRMA**[2] "Yaxdırmaq[2]"dan *f.is.*

**YAXDIRMAQ**[1] *icb.* Bir şeyin üzərinə sürtdürmək, çəkdirmək. *Dirəyin üzərinə qatran yaxdırmaq.*

**YAXDIRMAQ**[2] *məch.* Yaxmağa, yandırmağa məcbur etmək, başqasına yandırtmaq.

**YAXI** *is.* 1. Yağ xüsusiyyətləri olan maddə; yaxıla, sürtülə bilən hər cür maddə; sürtkü. // Sürtülən, yaxılan dərman.

2. Yağ sürtülmüş çörək parçası; yaxmac.

3. *incəs.* Fırça ilə yaxılmış nazik rəng qatı.

**YAXIB-YANDIRICI** *sif.* 1. Bərk yandıran, çox isti; qızmar.

2. *məc.* Qəlbə əzab verən, ürəyi incidən, yandırıb-yaxan, bərk acıdan. *Yaxıb-yandırıcı sözlər. – Ruhülqüds mənə yaxıb-yandırıcı bir məktub yazmışdı.* M.F.Axundzadə.

**YAXIB-YANDIRMA** "Yaxıb-yandırmaq"-dan *f.is.*

**YAXIB-YANDIRMAQ** *f.* 1. Bərk yandırmaq. *Qızmar günəş üz-gözümüzü yaxıb-yandırır. – Cəhənnəm alovu kimi insanı yaxıb-yandıran Tehran istisinə dözmək hünərdir.* M.İbrahimov.

2. *məc.* Mənən incitmək, qəlbə əzab vermək, ürəyi incitmək, yandırıb-yaxmaq, bərk acıtmaq. *Onun sözləri adamı yaxıb-yandırır.*

**YAXIB-YIXMAQ** *f.* Yandırıb dağıtmaq, məhv etmək. [Nadir bəy:] *Həmcinsinə qıymaqdan, yaxıb-yıxmaqdan zövq alanlar, baş-*

*qasının fəlakətində səadət arayanlar birər adi cəlladdan başqa bir şey deyildir*. H.Cavid.

**YAXICI**[1] *sif.* və *is.* Bir şeyi yaxan. *Yaxıcı alət.*

**YAXICI**[2] *sif.* Yandırıcı, çox isti, çox qızğın; qızmar. *Yaxıcı, amansız hərarət* [Arazı] *gündən-günə mum kimi əridib quru skeletə döndərmişdi.* A.Şaiq.

**YAXIQ** *is.* Yaxılmış, yanmış yer; yanıq.

**YAXILAMA** "Yaxılamaq"dan *f.is.*

**YAXILAMAQ** *f. məh.* Yaxmaq, sürtmək.

**YAXILMA**[1] "Yaxılmaq[1]"dan *f.is.*

**YAXILMA**[2] "Yaxılmaq[2]"dan *f.is.*

**YAXILMAQ**[1] *məch*. Bir şeyin üzərinə sürtülmək, çəkilmək.

**YAXILMAQ**[2] *məch*. 1. Yandırılmaq.

2. B a x **yanıb-yaxılmaq**.

**YAXIN** *sif.* 1. Məsafə etibarilə çox uzaqda olmayan; yovuq (*uzaq* qarşılığı). *Yaxın çay. Yaxın yer. Evimizə yaxın mağaza. Yaxın aptekdən dərman al.* // Zərf mənasında. *Yaxın otur. Yaxın gəl. – Keşikçi yaxına gəlcək Telli xanım onun təpəsindən bir əmud ilişdirib öldürdü.* "Koroğlu". *İnsan oğlu, uzaqlaşma, gəl yaxın; Başqa yerdən alınmasın sorağın*. M.Müşfiq. *Pərşan iki qızla çiyid dolu çuvalı yaxına gətirdi*. M.İbrahimov. // Qısa. *Yaxın yol. Yaxın mənzil*.

2. Zaman etibarilə uzaq olmayan, tezliklə olacaq, yaxınlaşan; gələcəyinə, olacağına və s.-yə az qalmış. *Yaxın gələcək. Yaxın səfər. Yaxın görüşlərdə*. // Qan qohumluğu və ya dostluq münasibəti ilə bağlı olan. *Yaxın qohum. Yaxın dost. Yaxın yoldaş. – Telli, müəllimi özünə ən yaxın bir adam hesab edirdi.* S.Hüseyn. *Çox çəkməzdi ki, ev sahibinin qohum-əqrəbası, yaxın yoldaşlardan bəziləri yığılardı.* Mir Cəlal. ☐ **Yaxın olmaq** – 1) dost olmaq; yaxınlaşmaq. *Böyükxanım Qulam xana yaxın olmaq üçün qəlbində vəsilələr axtarırdı.* M.S.Ordubadi; 2) aralarında sevgi, məhəbbət olmaq, yaxınlıq olmaq. // *İs. mənasında.* Yaxın adam, dost; qohum. *Mənim yaxınlarım;* 3) oxşar, bənzər, çox oxşayan (bənzəyən). *Məzmunca bir-birinə yaxın əsərlər. Bir-birinə yaxın dillər. Sarıya yaxın bir rəng. Yaxın görüşlər.*

4. Bilavasitə aidiyyəti olan, dərindən maraqlandıran, ürəyinə görə olan, mənafeyini əks etdirən; doğma, əziz. *Bu kölgəli gecəni bayğın-bayğın seyr edir və ürəklərinə yaxın şeylərdən danışırlar.* M.S.Ordubadi. *Ədəbiyyat oxucuya, xalqa yaxın* (z.) *olmalıdır*. M.İbrahimov.

5. Mötəbər, inanılmış. [Aslan bəy:] *Yaxın yerdən bilmişəm, özü xəbər göndərmiş.* C.Cabbarlı.

6. *zərf* Təxminilik, təqribilik bildirir. *Üç aya yaxın bir müddət. Saat beşə yaxındır. Sabaha yaxın* (*sübh açılanda*). *Axşama yaxın* (*gün qaralanda*). *– Bir ilə yaxın idi ki, Gülpərinin zülmü davam edirdi.* S.S.Axundov. *Gecədən xeyli keçib, sübhə yaxındır artıq; Ey könül, dinlə, bahar öz qonağındır artıq*. S.Rüstəm. *Qafar yaşı əlliyə yaxın olan, xırdaca, arıq bir adamdı*. Ə.Əbülhəsən.

◊ **Yaxın durmaq** – 1) yaxınlaşmaq, yanına getmək; 2) köməyə gəlmək, əl yetirmək, hümmət göstərmək. *Heç kəs ona yaxın durmadı*. **Yaxın durmamaq** – 1) yaxınına belə gəlməmək, qətiyyən iştirak etməmək, heç maraq göstərməmək. *İşə yaxın durmur;* 2) hətta əl vurmamaq, meyil etməmək, toxunmamaq. *Yeməyə heç yaxın durmadı. – Əliqulu lavaş arasında iki yanmış sümük gətirdi, Məsmə ona yaxın durmadı.* Mir Cəlal. **Yaxın düşmək** – b a x **yaxın durmaq** 1-ci mənada. [Mehriban] *ərindən başqa bir* [kişini] *sevməyi bağışlanmayan bir qəbahət sanırdı. Bu qəbahəti əxlaqa müxalif bildiyi üçün Səlimə yaxın düşməkdən qorxur, mümkün olduğu qədər ondan qaçırdı.* S.Hüseyn. *Nə qədər əlində dövlət var idisə, Əmiraslan Gülpəriyə yaxın düşmürdü*. S.S.Axundov.

**YAXINDA** *zərf* 1. Yaxın yerdə, yaxınlıqda, uzaqda olmayaraq. *Yaxında bir meşə var. Yaxında toy var. – Bu arada, yaxında dörd-beş əl şiddətli tapança atılır.* H.Cavid.

2. Bilavasitə yanaşı; yaxın. *Yaxında əyləşin!*

3. Az vaxt sonra, çox keçmədən; tezliklə, yaxın vaxtda, yaxınlarda. *Yaxında gələcəkdir. Yaxında kəndə gedəcəyəm*. – [Sənəm:] *Necə? Yaxında toy eləyirsənmi?* Ü.Hacıbəyov.

4. Az zaman əvvəl, az müddət bundan qabaq. *Bu yaxında bir əhvalat olmuşdu*.

**YAXINDAKI** *sif.* Yaxında olan, qonşuluqda olan; yaxın. *Yaxındakı dükandan ət al. Yaxındakı evlər. – Qaçqınlar hamısı yaxındakı şah tutluğa tərəf yüyürdülər.* Ə.Vəliyev.

**YAXINDAN** *zərf* 1. Yaxın məsafədən, uzaqdan olmayaraq, yaxın yerdən. *Yaxından görmək. Yaxından bir səs gəldi.* – [Qəhrəman:] *Mən heç vaxt xanımı yaxından görməmişdim.* H.Nəzərli.

2. Çox yaxın, yaxşı. *Yaxından tanış olmaq. Onu yaxından tanıyıram.*

**YAXINGÖRƏN** *sif.* 1. Gözü uzağı görməyən və ya pis görən.

2. *məc.* Uzağı, gələcəyi görə bilməyən məhdud adam haqqında.

**YAXINLARDA** *zərf* 1. Yaxın yerlərin birində, bu ətrafda (bəzən "bu" sözü ilə). *Evimiz bu yaxınlardadır. O, bu yaxınlarda yaşayır.*

2. Bu günlərdə, bir az əvvəl, az müddət əvvəl. *Yaxınlarda gəlmişdir. Yaxınlarda dissertasiya müdafiə etmişdir. Yaxınlarda, deyəsən, yağış yağıb.* // Tez bir zamanda, yaxın bir vaxtda, bir az sonra, bu günlərdə. *Yaxınlarda yubileyi olacaq. Yaxınlarda əlli yaşı tamam olacaqdır. Yaxınlarda gedəcəyəm.*

**YAXINLAŞDIRILMA** "Yaxınlaşdırılmaq"dan *f.is.*

**YAXINLAŞDIRILMAQ** *məch.* Bir şeyə yaxın edilmək, bir şeyin yaxınına gətirilmək (qoyulmaq, çəkilmək); yanaşdırılmaq.

**YAXINLAŞDIRMA** "Yaxınlaşdırmaq"dan *f.is.*

**YAXINLAŞDIRMAQ** *f.* 1. Bir şeyin yaxınına çəkmək, yaxınına gətirmək; bir şeyə yanaşdırmaq. *Başmaqlarını bir-birinə yaxınlaşdırmaq. Maşını qapıya yaxınlaşdırmaq. Şkafı divara yaxınlaşdırmaq.* – *Arxitektor kreslosunu stola yaxınlaşdırdı.* M.İbrahimov. // Aralarında daha sıx əlaqə və münasibət yaratmaq. *Nəzəriyyə ilə təcrübəni bir-biri ilə yaxınlaşdırmaq. Elmlə istehsalatı bir-biri ilə yaxınlaşdırmaq.*

2. *məc.* Aralarındakı ünsiyyəti daha da artırmaq, aralarında dostluq, yaxınlıq münasibəti yaratmaq. *Zəhmət onları bir-birinə yaxınlaşdırdı.* – *Sanki bu təkrarlar* [Ağca xanımı] *oğluna – əllərini köksündə çataqlayıb yatan zəif, yetim və xəstə uşağa yaxınlaşdırırdı.* Mir Cəlal.

3. Zaman etibarilə tezləşdirmək.

4. Oxşatmaq, bənzətmək, uyğunlaşdırmaq. *Malı ən yaxşı nümunələrə yaxınlaşdırmaq.*

**YAXINLAŞMA** "Yaxınlaşmaq"dan *f.is. Bir-biri ilə yaxınlaşma. Qışın yaxınlaşması.* – *Münəvvər xanım gözlərini açıb sübhün yaxınlaşmasını hiss edirdi.* M.S.Ordubadi.

**YAXINLAŞMAQ** *f.* 1. Hərəkət edərək bir şeyin yaxınına gəlmək, yaxın durmaq, yanaşmaq üzrə olmaq; yanaşmaq. *Gəmi sahilə yaxınlaşır. Qatar stansiyaya yaxınlaşdı. Evə yaxınlaşmaq. Divara yaxınlaşıb durdum.* – *Zeynal, yavaşca addımlar ilə Mehribana yaxınlaşdı.* S.Hüseyn. *Obaya yaxınlaşınca uşaqlar, bir neçə yaşlı qadın və kişi qarşımıza çıxdı.* A.Şaiq. *Əşrəf yavaşcadan sürünüb kola yaxınlaşdı.* S.Rəhman. // Həmsərhəd olmaq, yanbayan olmaq. // Səs, işıq haqqında: getdikcə yaxşı eşidilməyə, görünməyə başlamaq. *Adamların hay-küyü yaxınlaşır.* C.Məmmədquluzadə. *Kəndimizin işıqları getdikcə yaxınlaşırdı.* İ.Əfəndiyev.

2. Vaxt, zaman və s. haqqında: çatmaq, yetişmək, olacağına çox az qalmaq. *Böhran yaxınlaşır. Bayram yaxınlaşmaqdadır.*

3. Yaxın əlaqə, ünsiyyət yaratmaq, yaxın olmaq, aralarından dostluq münasibəti yaratmaq. *Onları tanış edib yaxınlaşdırmaq lazımdır.*

4. Oxşamaq, bənzəmək, uyğun gəlmək.

5. *məc.* Yaxın olmaq, əlaqədar olmaq, mənafeyinə, tələbinə cavab vermək. *Ədəbiyyat getdikcə daha artıq həyata yaxınlaşır.*

6. Yanaşmaq, öz münasibətini bildirmək. *Kərim heç bir zaman işə soyuqqanlı, sakit ürəklə yaxınlaşa bilmirdi.* M.İbrahimov.

**YAXINLATMA** "Yaxınlatmaq"dan *f.is.*

**YAXINLATMAQ** b a x **yaxınlaşdırmaq**.

**YAXINLIQ** *is.* 1. Məsafə etibarilə çox uzaq olmama, yaxın olma. *Qəsəbənin dəmir yoluna yaxınlığı. Bazarın evə yaxınlığı. Yolun yaxınlığı.* // Yaxın yer, ətraf. *Yaxınlıqda heç bir zihəyat görünməyir, quyulardan neft dartan dərin tulunbaların yeknəsəq səsləri eşidilirdi.* S.Hüseyn. *Bu vaxt, birdən yaxınlıqda oxunan bir mahnı eşidildi*. İ.Əfəndiyev.

2. Zaman etibarilə uzaq olmama, yaxın olma; yaxınlaşma. *Qışın yaxınlığı. İmtahanların yaxınlığı.*

3. Yaxın münasibət, yaxın əlaqə; yoldaşlıq, dostluq münasibəti. *İnsanlar arasında yaxınlıq*. – [Müəllim və Tellinin] *arasında ruhi bir yaxınlıq vardı.* S.Hüseyn. *Rübabə ilə*

*Vahid arasında ünsiyyət doğduqca, yaxınlıq artdıqca Gəldiyevdə intiqam hissi alovlanırdı.* Mir Cəlal. ☐ **Yaxınlıq etmək** – dostluq etmək, bir-birinə yaxın olmaq, yaxın əlaqə saxlamaq. *Eldar* [Ceyran] *barəsində çox maraqlanır. Lakin yaxınlıq etməyə üzü gəlmir.* S.Hüseyn. *Qurban Mərəndi ilə* [Firidun] *bir daha yaxınlıq etmədi*. M.İbrahimov.

4. Uyğunluq, oxşarlıq, bənzərlik. *Tərcümənin orijinala yaxınlığı.*

**YAXIN-UZAQ** *sif.* və *zərf* 1. Həm yaxın, həm uzaq, müxtəlif. *Bu xəbəri eşidən yaxın-uzaq yerlərdən qəhvəçi dükanına gəlib Qəribin oxumasına qulaq asırdılar.* "Aşıq Qərib".

2. Gec-tez. [Dərviş:] *Nədənsə yaxın-uzaq Ruqiyyənin mənə vasil olmasını könlüm mənə anlatmışdı.* A.Divanbəyoğlu.

**YAXIŞMA** "Yaxışmaq"dan *f.is.*

**YAXIŞMAQ** b a x **yaraşmaq**. *Ruscaya gəldikcə, inanmıram, onu da bir ziyalı qadının ağzına yaxışır surətdə danışa bilsin.* A.Şaiq.

**YAXLAŞDIRILMA** "Yaxlaşdırılmaq"dan *f.is.*

**YAXLAŞDIRILMAQ** b a x **yaxınlaşdırılmaq**.

**YAXLAŞMA** "Yaxlaşmaq"dan *f.is.*

**YAXLAŞMAQ** b a x **yaxınlaşmaq**. *..Payan kəndinə yaxlaşırdıq.* M.S.Ordubadi. *Ata! Əl çəkəsi deyilik səndən! Deyərək, öz oğlu yaxlaşdı ona.* S.Vurğun.

**YAXMA[1]** 1. "Yaxmaq[1]"dan *f.is.*

2. *is.* Üzərinə yağ və s. yaxılmış çörək parçası; yaxmac. *Tapdıq dedi: – Ana, ona yağ yaxması ver!* Ə.Vəliyev.

**YAXMA[2]** "Yaxmaq[2]"dan *f.is.*

**YAXMAC** *is.* Üzərinə yağ, bal və s. sürtülmüş çörək parçası; yaxma. *Şlyapaların sahibi qadınlar stolun gözündən çıxardıqları yağ yaxmaclarını dişləri ilə çimdikləyirdilər.* Mir Cəlal. *Kimisi yaxmac qayırır, .. kimisi yağla şorun qatışığından dürmək eləyib Qəmərin stəkanının yanına qoyurdu.* Ə.Vəliyev.

**YAXMAQ[1]** *f.* 1. Qatı, yağlı bir maddəni bir şeyin üstünə sürtüb yaymaq. *Çörəyə kərə yaxmaq. – Çıxdım Aya baxmağa; Qapıya qıfıl taxmağa; Qıza xına gəlibdi; Əllərinə yaxmağa.* (Bayatı). [Məşədi İbad:] *Görünür ki, heyvan balası dəllək xınanı pis yaxıbdır.* Ü.Hacıbəyov. // Bulamaq, batırmaq.

2. *məc.* Əsassız olaraq isnad etmək, boynuna qoymaq, üstünə atmaq. [Fatma xanım:] *Sənin bu ləçər qızın mənim üstümə oğurluq yaxır.* N.Vəzirov. *..Çar agentlərinə və bir casusa yaraşan sifətləri bunun məsum və səmimi çöhrəsinə yaxa bilmirdim.* M.S.Ordubadi.

◊ **Qara yaxmaq** – b a x **qara**. **Ləkə yaxmaq** – b a x **ləkə**.

**YAXMAQ[2]** b a x **yandırmaq**. [Qərib:] *Bir söz ilə eldən-elə atıldım; Bu qərib ellərdə yaxdı nar məni.* "Aşıq Qərib". *Pərvanə yaxar var-yoxunu bir oda yetsə; Razı deyiləm kim, mənə pərvanə desinlər.* Qövsi.

**YAXŞI** *sif.* 1. Müsbət xüsusiyyətlərə və ya keyfiyyətlərə malik olan; öz keyfiyyəti ilə verilən tələbləri təmin edən, lazımi qaydada olan; bəyənilən (*yaman* ziddi). *Yaxşı yeməklər. Yaxşı mal. Yaxşı at. Yaxşı mənzil. Yaxşı xətt. Yaxşı tərcümə. Yaxşı şərait.* // Gözəl, xoş. *Yaxşı kitab. Yaxşı musiqiyə qulaq asdıq. Yaxşı təsir bağışladı. Yaxşı şeirlər yazır.* – [Gülçöhrə:] *Özü yaxşı, sözü yaxşı..* Ü.Hacıbəyov. // Sevimli, mehriban, əziz, istəkli ("mənim" sözü ilə nəvaziş bildirir). *Mənim yaxşı oğlum! Mənim yaxşı balam!* // Əlverişli, faydalı, dəyərli, müsbət. *Yaxşı məsləhət. Yaxşı nəticə. Yaxşı fikir söylədi.* // Xoş, səfalı. *Yaxşı hava. Yaxşı yerlərdə dincəlirik. Yay yaxşı* (z.) *keçdi.* // Təcrübəli, məharətli. *Yaxşı usta. Yaxşı dərzi. Yaxşı mütəxəssis. Yaxşı rəssam.* // Müsbət mənəvi keyfiyyətlərə malik olan; nəcib. *Yaxşı adam. Yaxşı qadın. Yaxşı insan.* – [Sultan bəy:] *Yaxşı adam? Mən! Gəl də!.. Gəl qohum olaq, mən də dulam.* Ü.Hacıbəyov. // Dəyanətli, sədaqətli. *Yaxşı yoldaş. Yaxşı dost. Yaxşı arvad.*

2. *Zərf mənasında.* Kifayət qədər, lazımınca, əməlli-başlı. *Yaxşı oxumaq. Yaxşı tanış olmaq. Yaxşı yazmaq.* – [Əsəd bəy:] *Hərçənd yoldaş tacirliyin fəndini çox yaxşı bilir.* M.S.Ordubadi. [Usta Məhərrəm:] *Özünüz deyin, harda yaxşı qan aldırmaq olar?* Ü.Hacıbəyov. [Əlləzoğlu] *şişlərdən döşəməyə yağ damlaları səpələyə-səpələyə, yaxşı bələd olduğu evdə ora-bura vurnuxdu, bufetin qapılarını taqqıldatdı.* İ.Hüseynov. // Tələbələrin biliyinə verilən "orta" qiymətlə "əla" qiymət arasında qiymət – "4". *Fizikadan "yaxşı" almaq. Bütün dərslərindən "yaxşı" alıb.*

3. Kifayət qədər, kafi miqdarda (böyüklükdə); çoxlu. *Yaxşı qazanc. Yaxşı artım. Yaxşı maaş. Yaxşı pul verirlər.* // *məc*. Güclü, qüvvətli, bərk, əməlli-başlı. *Yaxşı bir yumruq ilişdirdi.*

4. *Zərf mənasında.* Salamat, itkisiz, zərərsiz. *Bəladan yaxşı qurtardın.*

5. "Yaxşı", "razıyam", "sən deyən olsun" mənasında razılıq bildirir. *Yaxşı, mən də gedərəm. Yaxşı, sən də gəl. Yaxşı, əzizim, sən deyən olsun.* // Sual cümlələrində. [Əsgər:] *Yaxşı, bəy, fərz edək ki, mən xalamı verdim sənə, bəs əvəzində sən mənə nə verərsən?* Ü.Hacıbəyov.

6. "Yadda saxla", "çox əcəb", "baxıb görərsən" və s. mənasında hədə bildirir (bəzən təkrarla işlənir). *Yaxşı, görüşərik! Yaxşı, yaxşı, gör atana nə deyərəm.*

7. İs. mənasında. *Yaxşıların yaxşısısan; Gözəllərin xası, gəlin!* Aşıq Ələsgər.

8. **Yaxşılıqla** şəklində *zərf* – qalmaqalsız, rahatca, dalaşmadan, mübahisəsiz, əngəlsiz, xoşluqla. *Yaxşılıqla çıxıb getdi. Yaxşılıqla məsələ həll olundu.*

◊ **Yaxşı gün** – xoşbəxtlik, xoşbəxt həyat, yaxşı güzəran. **Yaxşı olmaq** – 1) sağalmaq. *Xəstə yaxşı oldu. Yara yaxşı oldu. – ..Cəmil ağanın başının ağrısı lap yaxşı oldu.* İ.Musabəyov; 2) kinayə tərzində məmnunluq ifadə edir; əcəb oldu. *Sənə lap yaxşı oldu.* **Yaxşı yol** – yola düşən adama xeyir-dua. *Usta Zeynal Mirzə Səfərin oğluna xeyir-dua verib, yaxşı yol ilə müvəffəqiyyət diləyib bir qızıl saat da verdi.* Ə.Haqverdiyev. *Qız:* "*Zəfərlə dönəsən, sənə yaxşı yol!*" *– dedi.* M.Rahim. **Yaxşını pisdən ayırd etmək** – işin məğzinə vararaq anlamaq, seçmək; məsələni hərtərəfli yoxlayıb düzgün nəticə çıxarmaq. *Rüstəm kişi Salmanı, cavan olsa da, gözüaçıq, işbacaran, yaxşını pisdən ayırd edən bir adam sayırdı*. M.İbrahimov. **Yaxşısı budur ki**... – ən münasib, ən məsləhət görülən şey haqqında. [Zeynal:] *Yaxşısı budur ki, bir-birimizdən həmişəlik ayrılaq..* S.Hüseyn. **Nə yaxşı, nə yaxşı ki** – məmnunluq bildirir. *Nə yaxşı, tez gəldin. Nə yaxşı ki, burada olmamısan.* – [Mərcan bəy:] *Nə yaxşı, razı oldu!* Ü.Hacıbəyov.

**YAXŞI-YAMAN** *is.* 1. Həyatda olan yaxşı və pis şeylər, müsbət və mənfi hallar. [Bədircahan:] *Allah vurub, deyir, cahılları, qocadan danış... Cahandidə, yaxşı-yamanı görmüş..* N.Vəzirov. ☐ **Yaxşı-yaman sanmaq (bilmək)** – yaxşısını pisindən ayırmaq. *Bəs ki uşaqdır hələ, yaxşı-yaman sanmayır; Elmin əbəs olduğun anlamayır, qanmayır*. M.Ə.Sabir. [Rüstəm:] *Yaxşı-yaman bilmək, irəli getmək üçün yaxşı yoldaş lazımdır*. S.Rəhimov. // Hal, vəziyyət. *Qövsi, ondan qeyri kim, könlüm onun yanındadır; Hiç kim vaqif deyil yaxşı-yamanımdan mənim*. Qövsi.

2. Yaxşı və pis sözlər, müsbət və mənfi fikirlər. *Hələ bir dəfə atam məni çağırdı ki, ay bala, qızın adına yaxşı-yaman deyirlər*. İ.Hüseynov.

3. *Zərf mənasında.* Babat, bir təhər, bir növ, bir qaydada. *..Məktəb öz başına qalıb, yaxşı-yaman öz işinə məşğul olubdur.* F.Köçərli.

**YAXŞICA** *zərf* Yaxşı. *Yaxşıca gəldin. Yaxşıca yadıma düşdü. Yaxşıca etdin. Yaxşıca cavabını verdin.* // Yaxşı-yaxşı, lazımi surətdə. *Bəlli Əhməd bazu-bəndi də, qızılları da yaxşıca gizlətdi.* "Koroğlu". [Gülçöhrə:] *Bir də görsəydim, yaxşıca diqqət edərdim..* Ü.Hacıbəyov. [Qəhrəman:] *Mən burada dörd nəfər yoldaşım və bir pulemyot ilə həm körpünü, həm də meydanı yaxşıca atəşə tuta bilərdim.* H.Nəzərli. // Sif. mənasında. *Hətta namaz vaxtı da mömin müsəlmanın fikri və zikri dolu olur yaxşıca yağlıca bozbaş ilə.* C.Məmmədquluzadə.

**YAXŞILANDIRILMA** "Yaxşılandırılmaq"-dan *f.is.*

**YAXŞILANDIRILMAQ** b a x **yaxşılaşdırılmaq**.

**YAXŞILANDIRMA** "Yaxşılandırmaq"dan *f.is.*

**YAXŞILANDIRMAQ** b a x **yaxşılaşdırmaq**. *Keçən zəmanədə insan köçəri olduğuna, yəni onun yeri çox olmağa binaən o, yerləri yaxşılandırmağa səy etməyib*. "Əkinçi".

**YAXŞILAŞDIRICI** *sif.* Bir şeyin keyfiyyətini, vəziyyətini daha da yaxşılaşdıran, təkmilləşdirən. *İş şəraitini yaxşılaşdırıcı tədbirlər.*

**YAXŞILAŞDIRILMA** "Yaxşılaşdırılmaq"-dan *f.is.*

**YAXŞILAŞDIRILMAQ** *məch*. Bir şeyin keyfiyyəti, vəziyyəti yaxşı hala salınmaq.

**YAXŞILAŞDIRMA** "Yaxşılaşdırmaq"dan *f.is.*

**YAXŞILAŞDIRMAQ** *f.* Bir şeyin keyfiyyətini, vəziyyətini daha yaxşı, daha mükəmməl, daha gözəl, daha əlverişli etmək. *Mənzil şəraitini yaxşılaşdırmaq. Əhvalını yaxşılaşdırmaq. Məhsulun keyfiyyətini yaxşılaşdırmaq. Mal-qaranın cinsini yaxşılaşdırmaq.*

**YAXŞILAŞMA** "Yaxşılaşmaq"dan *f.is.* [Zeynal] *Mehribanın yaxşılaşmasını, tamamilə xəstəlikdən sağalmasını gözləyirdi.* S.Hüseyn.

**YAXŞILAŞMAQ** *f.* Keyfiyyətcə, vəziyyətcə və s. cəhətdən daha yaxşı olmaq. *Vəziyyət gündən-günə yaxşılaşır. Ev şəraiti yaxşılaşmışdır.* // Sağlamlaşmaq, əmələ gəlmək, düzəlmək, qıvraqlaşmaq. *Tapdıq vücudca yaxşılaşmışdır.* Ə.Vəliyev. // Yaxşı olmağa, sağalmağa başlamaq, vəziyyəti düzəlməyə başlamaq. *Xəstə yaxşılaşır. Kurortdan sonra xeyli yaxşılaşmışdır.*

**YAXŞILIQ** *is.* İnsanın müsbət mənəvi keyfiyyəti, sifəti (*pislik, yamanlıq* ziddi). *Yaxşılığa yaxşılıq hər kişinin işidir; Yamanlığa yaxşılıq ər kişinin işidir.* (Ata. sözü). *Artıq səyimiz bunda olacaq ki, hamı müsəlman qardaşları özümüzdən razı edib, heç bir kəsin nə yaxşılığını və nə pisliyini danışmıyaq..* C.Məmmədquluzadə. *Yamanlıq, yaxşılıq durmuş üz-üzə; Dilsiz əsrlərdən mirasdır bizə.* S.Vurğun. // Yaxşı, müsbət iş. hərəkət; xeyirxahlıq, qeydkeşlik, kömək. *Adamlara yaxşılıq etmək. – Mənim yaxşılığımın əvəzində məni dünya işığına həsrət qoydun.* "Koroğlu". *Yamanlıq eyləmə bir şəxsə, yaxşılıq var ikən.* S.Ə.Şirvani. [Mirzə:] *Çox razıyam sizdən. Üç il bundan qabaq uşaqlar haqqında yaxşılıq indi də mənim yadımdan çıxmır.* Ə.Haqverdiyev.

**YAXŞILI-YAMANLI** *sif.* Həm yaxşısı, həm pisi olan, hər cür.

**YAXŞIRAQ** *sif. köhn.* Daha yaxşı. *..Hər bir divardan çölün havası içəri gəlir və hansından artıq gəlir isə, o divar yaxşıraqdır.* H.Zərdabi.

**YAXŞI-YAXŞI** 1. *sif.* Yaxşı (topluluq mənasında). *Yaxşı-yaxşı yeməklər. Yaxşı-yaxşı şeylər.* – [Şəhərdə] *gördüm ki, bu yaxşı-yaxşı adamların surətlərini necə yaradırlar.* S.Rəhimov.

2. *zərf* Dərindən, ətraflı, diqqətlə, lazımınca, əməlli-başlı. *Bir yaxşı-yaxşı fikirləş. Materialı yaxşı-yaxşı öyrənməli. – Gözlərini açıb bir yaxşı-yaxşı bax.* S.Rüstəm.

**YAXŞI-YAMANLIQ** *is.* Bir şeyin yaxşılıq və pislik cəhətdən keyfiyyəti; bir hərəkətin, işin mənəvi cəhətdən necəliyi.

**YAXTA** *is.* [*ing.*] Yelkənli və yaxud motorlu idman qayığı.

**YAXT-KLUB** [*ing.* yach-club] 1. Su idmanı ilə məşğul olan idmançıları birləşdirən təşkilat. *Yaxt-klub üzvü. Yaxt-klub qayıqları.*

2. Həmin təşkilatın su stansiyası, onun yerləşdiyi bina. *Yaxt-kluba gedirəm. Yaxt-klubda məşqlər aparılır.*

**YAXUD** *bağl.* [*fars.*] Həmcins söz və ya cümlələri bir-birinə bağlayır, "və ya", "ya da" mənasında işlənir (bəzən "və yaxud", "yaxud da" şəklində də işlənir). *Bu gün, yaxud sabah gedəcəyik. – ..Mahmud bacısını bir yerə, yaxud bir kimsəyə verib başından rədd etməyi qərara aldı.* B.Talıblı. *Siz bəlkə zənn edirsiniz ki, mən Xədicəni sevmişdim və yaxud sevişmişdik..* S.Hüseyn.

**YAİNKİ** *bağl. köhn.* Yaxud, ya, ya ki, ya da. *Rüxsari-alın üzrə o xali-siyahmıdır? Yainki mayeyi-dili-məcruh dağıdır.* S.Ə.Şirvani. *..Hər kəs rusca, yainki .. gürcücə, yainki avropalılar işlətdikləri hürufat ilə yazı yazmaq bilir, – bizim sözlərimizi başa düşər və bilər ki, nə deyirik.* C.Məmmədquluzadə.

**YAK** [*tibetcə*] Tibetdə yetişdirilən, iri buynuzları və uzun tükləri olan, gövşəyən iri heyvan; Tibet camışı.

**YAKOBİN** [*xüs. addan*] *tar.* XVIII əsrin axırında Fransa burjua inqilabı zamanı "Yakobin klubu" deyilən siyasi təşkilatın üzvü olan inqilabçı-demokrat.

◊ **Yakobin klubu** – XVIII əsrin axırında Fransa burjua inqilabı dövrü siyasi təşkilatı.

**YAKOBİNLİK** *is. tar.* Yakobinlərin prinsipləri və siyasi hərəkatı.

**YAKUT(LAR)** *is.* Yakutiya Respublikasının yerli əhalisi; türkdilli xalqlardan biri (özlərini saxa da adlandırırlar).

**YAQMA** "Yaqmaq"dan *f.is.*

**YAQMAQ** b a x **yaxmaq**[2]. *Rəhm edib aşiqini həşr günü yaqmayalar; Ki, bu dünyada əsiri-qəmi-hicran olmuş.* Füzuli. *Bir dəm səni ol atəşi-rüxsar yaqmadı; Sən ey hicab, səddi-İskəndərmisən, nəsən?* Qövsi.

**YAQUT** *is.* [*ər.*] 1. Qırmızı rəngdə olan qiymətli daş. *Yaqut üzük* (*qaşı yaqutdan olan üzük*). *– Qaş-daşı əlli, vəzni yüz misqal; Qırx daşı ləldir, onu yaqut.* S.Ə.Şirvani. [Hacı Murad:] *..Bu rəngdə yaqut heç Xəta padşahının xəzinəsində də tapılmaz.* S.S.Axundov.

2. *məc. şair.* Al-qırmızı rəng simvolu kimi. *Aç o yaqut dodağını, ey xanım, aç! Ortaya inci, cəvahir, dür saç!* A.Şaiq. *Şaxta vurub buz donsa da sənin yaqut yanağında; El qeyrəti, vətən eşqi gülər açıq dodağında.* S.Vurğun.

**YAL**[1] *is.* 1. Atın (və bəzi heyvanların) boynunun üst hissəsində bitən uzun tüklər. *Əli ilə atın üzünü, gözünü, yalını, sağrısını tumarladı.* "Koroğlu". *Bəy ata yaxınlaşdı, əli ilə onun yalını tumarladı, qayışlarını yoxladı, səliqəsiz görünən tapqırını düzəltdi.* M.Hüseyn.

2. *məc. dan. zar.* Saç, saqqal mənasında. [Cənnətəli ağa:] *İki dəfə* [həna] *qoydurmuşam, saqqalım genə hələ kürən ağ yaldı.* N.Vəzirov. *Gündə həna bağlagilan yalına; Açma gözün, baxma bir öz halına.* Ə.Qəmküsar. ☐ **Yalı ağarmaq** *dan. zar.* – qocalmaq. *Həştada yetmişdir sinnü salımız; Bu dövlətdə ağarmışdır yalımız.* Q.Zakir. *Deyilik naşı, bu işdə, ağarıbdır yalımız.* M.Ə.Sabir. *Yalın ağarmış, yox ağızda dişin.* Ə.Nəzmi.

**YAL**[2] *is.* Hündür bir yerin təpəsi; dikdir, yoxuşun başı. *Yol ötdüm, çıxdım yala; Nahaqdan düşdüm qala; Əyil üzündən öpüm; Candan çıxsın dərd-bəla.* (Bayatı). *Səfiqulular kəndinin qabağındakı hündür yal ilə Şehli kəndinə gedən yol görünürdü.* S.Rəhimov. *Dərəni keçib düşmənin müdafiədə durduğu yala qalxmağa başlarkən birinci güllə atıldı.* Ə.Əbülhəsən.

**YAL**[3] *is.* İtə verilən horra halında yemək. *İt yalı. – Hər kəs öz itini alaçığa çəkib qabağına yal tökür.* "Qaçaq Nəbi". [Ağakərim xan:] *Xeyr a... gədə köpəyə yal verməmişdi, o barədə söylənirdim.* N.Vəzirov. // *məc.* Çox dadsız, keyfiyyətsiz, duru yemək haqqında.

◊ **Yalı artmaq (artıq düşmək)** *vulq.* – varlanmaq, dövlətlənmək mənasında. [Aşıq Vəli:] *Qohum-əqrəbasına yalı artanda təşəxxüs edənə lənət!* N.Vəzirov. *Caydaq adam qapını bərk basıb əlavə etdi: – Yalı artıq düşüb!* Mir Cəlal.

**YALADILMA** "Yaladılmaq"dan *f.is.*

**YALADILMAQ** *məch.* Yalamağa məcbur edilmək. *Qoyuna, qoça qənd verilir, duz yaladılır, su içirdilirdi.* Mir Cəlal.

**YALAQ**[1] *sif. dan.* 1. B a x **yaltaq**. [Qumru:] *Getsin yalaq Səkinəni aldatsın.* Mir Cəlal. *..Adam yada yalaq, qohuma çolaq olmaz.* Ə.Vəliyev.

2. Qarınqulu, yemək düşkünü, gözüdoymaz; qab dibi yalayan.

3. Yavadanışan, ağzıpərtov.

**yalaq-yalaq** *zərf* Yaltaq-yaltaq. *Yalaq-yalaq danışmaq.*

**YALAQ**[2] *is.* İtə yal tökmək üçün çuxur yer və ya qab.

**YALAQLANMA** "Yalaqlanmaq"dan *f.is.*

**YALAQLANMAQ** *f.* Yaltaqlıq etmək, yaltaqlanmaq.

**YALAQLIQ** *is.* 1. Yaltaqlıq.

2. Yemək düşkünlüyü, acgözlük, qarınquluəluq, gözüdoymazlıq, qab dibi yalama.

3. Ağzıpərtövlük, danışarkən pis, ədəbsiz sözlər işlətmə.

**YALAMA** 1. "Yalamaq"dan *f.is.*

2. Yalamaq üçün atın qabağına qoyulan duz parçası. *Qaraxan xəlvəti içəriyə girib balaca duz yalamasını götürüb arxalığının cibinə saldı.* S.Rəhimov.

**YALAMAQ** *f.* 1. Bir şeyin üstünə dilini sürtmək. *..Tulaların biri qaçıb gəldi Qurbanəli bəyin qabağına və başladı bəyin ayaqlarını yalamağa.* C.Məmmədquluzadə. *Bu vaxt sürüdən ayrılmış bir qoyun yeni doğduğu quzunu yalayırdı.* M.S.Ordubadi. [Südabənin anası] *susub, qurumuş dodaqlarını yaladı.* M.İbrahimov. // Dilini bir şeyə sürtüb bulaşdıraraq udmaq və ya içmək. *Balı yalamaq. Boşqabdakı mürəbbəni yalamaq.*

2. *məc.* Üzdən dəyib keçmək, azacıq toxunmaq. *..Qırmızı alov isə dilini çıxarıb yanyörəni yalayırdı.* S.Rəhimov. *Güllə onun başını yalayıb keçmişdi.* R.Rza.

◊ **Düz kimi yalamaq** – b a x **duz**.

**YALAN** *is.* Aldatmaq məqsədi ilə deyilən əsilsiz söz (*doğru, gerçək* ziddi). *Yalan söyləmək. – Surxay öz yalanından utanıb qıpqırmızı oldu.* M.Hüseyn. □ **Yalan danışmaq** – yalançılıq etmək, doğru söyləməmək, danışarkən həqiqəti gizlətmək. [Kişi:] *Bütün rayon onu da bilir ki, bu bir ildə mən hələ yalan danışmamışam.* İ.Hüseynov. **Yalan satmaq** – aldatmaq, yalan demək. *Yalan satar tamam bir-birinə; Zahirdə ittifaq, batində nifaq.* Q.Zakir. [Sultan:] *Bütün rayon bilir ki, Sultan Əmirliyə yalan satmaq adama çox baha oturur.* İ.Hüseynov. **Yalan yerə** – yalandan, yalan olaraq, aldatmaq məqsədi ilə; nahaq, səbəbsiz. **Yalan(a) çıxmaq** – əsli olmadığı meydana çıxmaq, düz çıxmamaq. **Yalanı çıxmaq** – doğru danışmadığının üstü açılmaq, sözlərinin yalan olduğu aşkara çıxmaq. **Yalanını tutmaq** – düz danışmadığını ifşa etmək, danışdığı sözlərin əsilsiz olduğunu bəlli etmək. *Hər kəs istəyir ki, mənim yalanımı tutsun, təvəqqe edirəm, bu yazdığıma yaxşı diqqət eləsin.* C.Məmmədquluzadə. // *sif.* Düz olmayan, əsli olmayan, qeyri-həqiqi, qeyri-gerçək; uydurma. *Yalan söz. Yalan xəbər. Yalan vədlər. – Müridlərdə bütün bidəti, cinayəti, fisqi; Yalan hədisləri rövzəxanda görməli imiş.* M.Ə.Sabir.

◊ ...**yanında yalandır** – müqayisə bildirir. *Kəşfiyyat quyusundan elə neft çıxır ki, onun yanında Suraxanı nefti yalandır.* M.Hüseyn.

**YALANBAŞDAN** *zərf dan.* Başını aldadaraq, tovlayaraq, yalandan, qeyri-ciddi olaraq. *Hər gün bir-iki saat Nardan xanım durub gələrdi Zərnigarın yanına. Yalanbaşdan Zərnigarın başını aldadıb tez durub gedərdi Murtuzun yanına.* (Nağıl). *Lotular oturub bir qədər mərhumu yalanbaşdan yad edib göz yaşı axıtdılar.* "Aşıq Qərib".

**YALANÇI** 1. *is.* Yalan danışan adam, yalan danışmağı özünə adət etmiş adam. *Yalançının biridir. Yalançının sözünə inanma. –Yalançının şahidi yanında olar.* (Ata. sözü). *Çünki o məlunların əxbarı əksər övqat nəticə bağışlayır, amma özləri yalançı və bədzatdırlar.* M.F.Axundzadə. *Doğru deyən olsaydı, yalançı usanardı; Avarə qalanlar dəxi bir söz də qanardı.* M.Ə.Sabir. □ **Yalançı çıxmaq** – vədinə əməl etməmək, sözünü yerinə yetirməmək. [Cəmilə:] *Yalançı çıxmayım deyə gəldim.* S.Hüseyn.

2. *sif.* Süni, uydurma, qeyri-həqiqi, əsilsiz, saxta, doğru olmayan. *Yalançı təbəssüm. Yalançı göz yaşları. – ..Atam heç şəhərli də deyil idi ki, bəylərə bazarlıq eliyə-eliyə axırda bir yalançı bəylik qazana idi.* C.Məmmədquluzadə

**YALANÇIBAŞ** *məh.* bax **yalançı** 2-ci mənada.

**YALANÇILIQ** *is.* Yalançının xasiyyəti, yalan danışma xasiyyəti. *Yalançılıq etmək.* – [Kələntər] *təsadüfən yalançılıq, gopçuluq və hay-küylə bu vəzifəyə yüksələ bilmişdi.* M.İbrahimov. // Yalan, uydurma sözlər. *Buradakı yalançılıq yuxarıda göstərilən kitablarda olandan daha artıqdır.* M.S.Ordubadi.

**YALANDAN** *zərf* Əsli olmadan, aldadaraq, aldatmaq məqsədi ilə. *Yalandan demək. – Şəmsiyyə şübhələnirdi, atasının onu aldatdığını, yalandan arxayın saldığını düşünməyə başlayırdı.* M.İbrahimov. // Süni surətdə, süni olaraq, ciddi olmayaraq; yalanbaşdan. *Yalandan özünü şad göstərmək. Yalandan gülmək* (*ağlamaq*).

**YALAN-GERÇƏK** *zərf* Yalandan, ya doğrudan. [Kişi:] *Aşıq, qaçaqların qorxusunnan onnarın hamısını tərifləyirsən, yalan-gerçək bizi inandırırsan.* "Aşıq Ələsgər".

**YALANĞUŞDAN** *dan.* bax **yalanbaşdan**. *Cəhənnəmlik libasını geyənsən; Yalanğuşdan müsəlmanam deyənsən.* Aşıq Baxış.

**YALANQOZ** *is. bot.* Qoz fəsiləsindən ləkvari yarpaqlı meşə ağacı.

**YALANLAMA** "Yalanlamaq"dan *f.is.*

**YALANLAMAQ** *f.* Yalan olduğunu göstərmək, bildirmək; təkzib etmək.

**YALANLIQ** *is.* Əsilsizlik, əsli olmama, düz olmama, doğru olmama. *Xəbərin yalanlığı. Sözün yalanlığı. – Kəndçilər etdilər dübarə hücum; Yenə oldu yalanlığı məlum.* M.Ə.Sabir.

**YALANMA** "Yalanmaq"dan *f.is.*

**YALANMAQ** "Yalamaq"dan *məch.*

**YALAN-PALAN** *top. dan.* Yalan sözlər, boş, əsilsiz sözlər. [Mirzə:] *Yalan-palandan sənə sonra söylərəm.* Ə.Haqverdiyev. ..[Hamı] *olmazın yalan-palanı eşitməkdən yorulmuşdu.* Ə.Əbülhəsən. // *Sif. mənasında.* Saxta,

uydurma. [Barat:] *Bu yalan-palan kağızlar mənim qulağıma girməz*. C.Cabbarlı.

**YALANSITMA** "Yalansıtmaq"dan *f.is.*

**YALANSITMAQ** *f.* Deyilən doğru sözü yalana çıxartmağa çalışmaq, yalan saymaq, təkzib etmək; danmaq. *Həqiqəti yalansıtmaq olmaz*.

**YALANSIZ** *sif.* Düzgün, doğru, həqiqətən olmuş, gerçək. *Yalansız söz*. // *zərf* Yalan söyləmədən, yalan danışmadan, aldatmadan. *Nə eləyim, qibleyi-aləm sağ olsun, yalansız* (z.) *keçinmək olmur*. "M.N.lətif."

**YALAN-YANLIŞ** *zərf* və *sif.* Düzgün və mükəmməl olmayaraq, yalan və səhvlərlə dolu. [Axund] *ərəbcə, farsca yalan-yanlış bir qədər danışdı*. Qantəmir. *Səlimnaz arvad evin xanımı ilə çoxdan dostlaşmışdı. Hələ onun adını da yalan-yanlış öyrənmişdi*. M.Hüseyn.

**YALAŞMA** "Yalaşmaq"dan *f.is.*

**YALAŞMAQ** *qarş.* Bir-birini yalamaq. *Quzular yalaşırlar. Küçüklər yalaşırlar*.

**YALATDIRMA** "Yalatdırmaq"dan *f.is.*

**YALATDIRMAQ** *icb*. Yalamağa məcbur etmək.

**YALATMA** "Yalatmaq"dan *f.is.*

**YALATMAQ** *icb.* Yalamağa məcbur etmək.

**YALAVAC** *sif.* və *is.* Ac-susuz, yeməksiz (çox vaxt "ac-yalavac" şəklində işlənir – əsil mənası: "bir xəbər bildirmək üçün göndərilmiş adam, müjdəçi, peyğəmbər"). [İmamyar:] *Qoy mən ac olum, yalavac olum, təki işiniz yerisin*. C.Cabbarlı.

**YALAVACLIQ** *is.* 1. Yalavacın hal və vəziyyəti; aclıq.

2. Üst-baş, paltarlıq parça. [Əsgər bəy:] *Xeyr, Hacı, yalavaclıq üçün gəlməmişik, bir ayrı mətləbimiz var*. M.F.Axundzadə. *Qızım üçün bir az yalavaclıq almışam, aparıram. Sabah qızımın toyudur*. Ə.Haqverdiyev.

**YALÇIN** *sif.* Çox dik və çılpaq, sıldırımlı, sarp. *Yalçın qayalara sinə gərərək; Azğın ərəblərlə durdu üz-üzə*. S.Vurğun. *Azad və məğrur Qafqazın uca dağlarını, yalçın, qartallı və müdhiş qayalarını, yollarını, körpülərini seyr edirdi*. Mir Cəlal.

**YALDIZ** *is.* 1. Bir şeyə qızıl və ya gümüş rəng və parlaqlığını vermək üçün onun üzərinə çəkilən qızıl, ya gümüş suyu. // Parlaq. [Şair:] *Qəlbimizin ilk baharı .. yaldız günəşi, incə buludları – həp sizə mədyundurlar*. Çəmənzəminli.

2. *məc*. Zahirən bəzəkli, parlaq, gözəl, gözəllik.

**YALDIZLAMA** "Yaldızlamaq"dan *f.is.*

**YALDIZLAMAQ** *f.* 1. Qızılı, gümüşü rəng vermək, qızıl və ya gümüş suyu vermək, qızıl və ya gümüş kimi parlatmaq, cilalandırmaq. *Yavaş-yavaş sönür, batır yıldızlar; Sarı bulud göyün üzün yaldızlar*. A.Səhhət.

2. *məc*. Zahiri bəzək vermək.

**YALDIZLI** *sif.* 1. Üzərinə qızıl və ya gümüş suyu verilmiş, qızıl və ya gümüş kimi parlaq. // Parlaq. [Ərən:] *Axşamlar ay yaldızlı qanadını Nil çayının üzərinə gərərkən zənci qızı saray tayfasını yuxuya verib gəlir, ikisi də xurma kölgəliklərinə çəkilərək sevgi şərbətindən içirdilər*. Çəmənzəminli.

2. *məc*. Zahiri bəzək, zahiri parlaqlıq. *Yaldızlı sözlər*.

**YALIN** *sif.* 1. Çılpaq, açıq, heç bir şeylə örtülü olmayan. *Ayaqları yalın* (ayaqqabısız). – [Uşaqların] *yalın ayaqları dizlərinədək palçığa batmışdı*. Çəmənzəminli.

2. Boş, heç bir şeysiz. [Firidun:] *..Biz heçdən bir şey yaratmalı, yalın əllərlə zindanları, zəncirləri qırmalıyıq*. M.İbrahimov.

◊ **Yalın qılınc** – sıyrılmış, qınından çıxarılmış (qılınc). *Yalın qılıncları ilə onların səflərinə həmlə edib ol gün axşam olunca cəng elədilər*. "Dərbəndnamə".

**YALINAYAQ** b a x **ayaqyalın**. *Məşədi bəy cındır paltarlı, yalınayaq uşaqları bir-bir qucaqlayıb öpdü*. M.Hüseyn.

**YALINBAŞ** b a x **başıaçıq**.

**YALINCA** *zərf* Tamamilə çılpaq, açıq.

**YALINQAT** *sif.* 1. Ancaq bir qat; astarı olmayan, astarsız. [Molla Qasımın] *belində üstü sarı ipəklə çəkilmiş naxışlı ağ qurşağı, ayağında genbalaqlı ağ kətandan lifəli yalınqat tumanı var idi*. H.Sarabski. *Gülsənəm lap arıqlamış, yalınqat, nazik, yamaqlı büzmənin içində oturmuş və fikrə getmişdi*. S.Rəhimov.

2. *məc*. Çox arıq, sısqa, cansız, sağlam olmayan. *Mənim kimi yalınqatdan nə hasil; Adam gərək ola püsərək topçaq*. Q.Zakir.

**YALINLAŞMA** "Yalınlaşmaq"dan *f.is.*

**YALINLAŞMAQ** *f.* 1. Getdikcə naziklәşmәk.

2. Çılpaqlaşmaq.

**YALINLIQ** *is.* Yalın şeyin halı, çılpaqlıq. *Talıb xanın .. yalınlıqdan olub dabanı çat-çat.* Q.Zakir.

**YALXA, YALXI** *sif. məh.* 1. Yanında başqa bir şey olmayan; yalnız, tәk. *Səməd döşəmədə, yalxı döşəkağı üzərində köynəkçək uzanmışdı.* İ.Hüseynov.

2. Ancaq, yalnız. *Yalxı bizi eyləməyib mübtəla; Səfheyi-Qafqazı tutub bu bəla.* M.Ә.Sabir.

**YALQIZ** *sif.* 1. Tәk, kimsәsiz, yalnız, tәk-tәnha. *Bir mən, bir sevdiyim, bir otaq, yalqız; Deyib-danışmağın nə damağı var!* Aşıq Әlәsgәr. // Zәrf mәnasında. *Sən ki ey bülbül, məni heç yerdə yalqız qoymadın.* Qövsi. [Heydәr bәy:] *Yoldaşlarım yoxdur, yalqız gəlmişəm.* M.F.Axundzadә. *Dörd divar içində yalqız durmadı; O duydu hər qışı, hər baharı da.* S.Vurğun.

2. Ancaq, tәkcә, müstәsna olaraq. *Elə yalqız Zakir deyil gileyli; Azürdədir aləm sərasər səndən.* Q.Zakir.

**YALQIZCA** *zərf* Tәk, tәk-tәnha, yanında heç kәs olmadan. *Yalqızca oturmaq. – Qoçpolad qalxmışdı Boranlı dağa; Yalqızca yaşardı kin boğa-boğa.* A.Şaiq. [Müәllim] *gecələrini təkbaşına, yalqızca keçirirdi.* S.Hüseyn.

**YALQIZLAMA** "Yalqızlamaq"dan *f.is.*

**YALQIZLAMAQ** *f.* Yanında heç bir kәs olmamaq, yalqız qalmaq, tәk-tәnha qalmaq. // Yalqız qoymaq, tәklәmәk. *Məni yalqızladı dərdü bəlayi-yar bir yandan.* Qövsi.

**YALQIZLIQ** *is.* Tәklik, tәk-tәnhalıq, yalnızlıq, tәk qalma. *Birdən* [müәllimin] *fikrinə gəldi ki, Telli yalqızlıqdan qorxar.* S.Hüseyn. *Müşkünaz uşaqlıqdan təkliyi sevmir, yalqızlıqdan daralırdı.* Ә.Vәliyev. // Kimsәsizlik, adamsızlıq. *Durnanın yetimlik, yalqızlıq iztirabları ilə pərvəriş tapmış qəlbi, bu sakit sevginin sadə, mehriban axşamları ilə bəxtiyar idi.* İ.Әfәndiyev.

**YALQUZAQ** *is.* Canavar, qurd; tәk gәzәn canavar. *Qəflətən yalquzaq çıxdı dərədən; Yapışdı qır kimi, qumral kərədən.* H.K.Sanılı. *Camalın əlindən nə yalquzaq, nə ayı, nə də pələng qurtara bilirdi.* S.Rәhimov. [Sirat:] *..Ən axırda yalquzaq kimi tək qalacağam.* Ә.Әbülhәsәn.

**YALLAMA¹** "Yallamaq¹"dan *f.is.*

**YALLAMA²** *zərf* Yalından tutaraq. *Safo da bilir, cayıl, ağzıboş vaxtlarımda hər əlim ilə bir xam atı qaçaraqda quyruğundan saxlayar, hər birisini yallama minərdim.* S.Rәhimov.

**YALLAMAQ¹** *f.* Yüyәnsiz atı yalından tutaraq sürmәk.

**YALLAMAQ²** *f.* İtlәrә yal (yem) vermәk.

2. *məc. vulq.* Rüşvәt vermәk.

**YALLANMA** "Yallanmaq"dan *f.is.*

**YALLANMAQ** *məch.* 1. İtlәrә yal verilmәk.

2. *məc. vulq.* Rüşvәt almaqla varlanmaq.

**YALLI¹** *is.* Yalı olan (b a x **yal¹**). *Hər dalğa bir kişnəyən bəyaz yallı at kimi; Bizim bu həyat kimi.* M.Müşfiq.

**YALLI²** *is.* Bir-birinin әlindәn tutaraq dәstә ilә oynanılan Azәrbaycan xalq rәqsi. *Yallı havası. – Alaq vuranların mahnıları, taya vuranların nəğmələri, qocaların yallısı, cavanların gülüşməsi Budağı valeh etmişdi.* Ә.Vәliyev. ☐ **Yallı tutmaq (getmək)** – yallı oynamaq. [Toybaşı:] *Uşaqları durğuz, bir yallı tutsunlar.* Ә.Haqverdiyev. *Burda dəstə-dəstə gəzən balalar; Əl-ələ tutuşub yallı gedirlər.* S.Vurğun.

**YALLI³** *zərf* Yal vermәklә, yal yedirmәklә. [Hacı Osman:] *Çobanların, köpəklərin necədir, a Vəli, yallımı saxlayırsan onları?* N.Vәzirov.

**YALLIBAŞI** *is.* Yallı oyununa başçılıq edәn şәxs.

**YALLIBAŞILIQ** *is.* Yallı oyununa başçılıq etmә. *Yallıbaşılıqda da bu Dəlidağda heç bu qudurğanların tayları yoxdur.* S.Rәhimov.

**YALLIQ** *sif.* Yal üçün yararlı (b a x **yal³**).

**YALMAN** *is.* b a x **yal¹** 1-ci mәnada. *Min Qazaxda köhlən ata; Yalmanına yata-yata; At qan tərə bata-bata; Göy yaylaqlar belinə qalx.* S.Vurğun. *Koxa atın yalmanından tutub ləngərlə qalxdı.* S.Rәhimov.

**YALMANIB-YALTAQLANMAQ** *f. məh.* Yaltaqlıq etmәk. *Məclisdəkilər yalmanıb-yaltaqlanıb eşşəyin tərifini göyə çıxarırlar.* "M.N.lәtif."

**YALMANLAMA** "Yalmanlamaq"dan *f.is.*

**YALMANLAMAQ** b a x **yallamaq¹**. [Әl-altı:] *Mən qaçaraqda qatırı minib onu*

*yalmanlamasam, onda atam Bəbəşin oğlu deyiləm!* S.Rəhimov.

**YALMANLANMA** "Yalmanlanmaq"dan *f.is.*

**YALMANLANMAQ** "Yalmanlamaq"dan *məch.*

**YALMANLI** bax **yallı**[1].

**YALMANMA** "Yalmanmaq"dan *f.is.*

**YALMANMAQ** *f. məh.* Yaltaqlıq etmək, baş əymək.

**YALNIZ** 1. *əd.* Məhdudiyyət bildirir – ancaq, təkcə. *Yalnız bircə şərtlə. Yalnız bir adam gəlmişdir. Məclisdən yalnız siz əskik idiniz. Yalnız bir arzum var. – Usta Zeynalın övladdan yalnız altı yaşında Tutu adlı bircə qızı vardı*. S.S.Axundov. *Mehriban əsəbiləşmişdi. Uşaqları düşünmək, onların halına acımaq yalnız onunmu vəzifəsi idi?* S.Hüseyn. *Yalnız o biri günün axşamı o, baş götürüb getdiyi uzaqlardan geri qayıtdı*. Ə.Məmmədxanlı.

2. *Zərf mənasında*. Tək, tənha, başqaları olmadan, başqalarından ayrıca. *Yola yalnız çıxdım. Uşaqları evdə yalnız qoymayın. Kimsə yox idi, yalnız idim. – Ata-anası bir yerə qonaq gedən vaxt Sonanı da istərdilər aparsınlar, lakin Sona* "*keyfim yoxdur*" *deyib, həmişə evdə yalnız qalırdı*. N.Nərimanov. *Mən o kişini indi yalnız gəzən görürəm*. S.Hüseyn. *Bəzən axşamüstü gəlirəm evə; Yalnız buraxmayır xəyalın məni.* S.Vurğun.

**YALNIZBAŞINA** *zərf* Tək, tək-tənha. *..Ləngrud çayı ilə aşağı doğru axan kərəçidə yalnızbaşına oturub dalğın və mükəddər bir halda düşünürdüm.* S.Hüseyn.

**YALNIZCA** *zərf* Yalnız, təkcə, tək-tənha. [Müəllim] *gecələrini təkbaşına, yalnızca keçirirdi*. S.Hüseyn.

**YALNIZLIQ** *is.* Təklik, tənhalıq. [Nadir bəy:] *Eşq öksüz bir çocuq kimi daima yalnızlıqdan xoşlanır.* H.Cavid. *Onda yoxdur izi əsla; Yalnızlığın, tənhalığın*. R.Rza.

**YALOV** bax **alov**.

**YALSIZ**[1] *sif.* Yalı olmayan (bax **yal**[1]). *Yalsız dayça.*

**YALSIZ**[2] *sif. dan.* Yal verilməmiş, yemək verilməmiş, ac. *Gülnaz və Səriyyə xala qapını döydüyü zaman* [Qəmərbanu] *yalsız yatan köpək kimi acıqlı idi*. M.İbrahimov.

**YALTAQ** *sif.* Yaltaqlıq edən, başqasına yaltaqlanan. *Yaltaq adam. – Mən dünyada hər şeydən artıq yaltaq adamlardan iyrənirəm.* M.S.Ordubadi. *Şeir gəzdi dilləri, gəlib çatdı saraya; Aldı yaltaq kübarlar Zülfüqarı araya.* B.Vahabzadə. // İs. mənasında. *Yaltaqlara aramızda yer yoxdur. – Olmasaydı cahanda sarsaqlar; Ac qalardı, yəqin ki, yaltaqlar.* M.Ə.Sabir. *Yaltaqları hazırlayan saraylar və hökmdarlardır*. M.S.Ordubadi.

**YALTAQCASINA** *zərf* Yaltaqlıq edərək, yaltaq-yaltaq, yaltaq adam kimi özünü alçaldaraq. *Yaltaqcasına hərəkət etmək. Yaltaqcasına* "*bəli, bəli*" *demək.*

**YALTAQLANMA** "Yaltaqlanmaq"dan *f.is.*

**YALTAQLANMAQ** *f.* Öz şəxsi xeyri və ya birinə xoş görünmək üçün başqasının qarşısında özünü alçaldaraq onun istədiyinə uyğun hərəkət etmək, danışmaq, riyakarcasına onu tərifləmək, yaltaqlıq etmək. *Dövlətliyə yaltaqlanmaq bilmərəm; Qəmli ikən yalan yerə gülmərəm.* M.Ə.Sabir. [Məmməd Aslan bəyə:] *Gedin, almanlara yaltaqlanın siz; Qandır, xəyanətdir bütün qəsdiniz*. Z.Xəlil.

**YALTAQLIQ** *is.* Öz şəxsi xeyri və ya birinin yanında öz qiymətini artırmaq üçün başqasının qabağında alçalaraq onun istədiyinə uyğun hərəkətlər etmə, riyakarcasına onu tərifləmə. *Yaltaqlıq etmək. Yaltaqlıq insanı alçaldan hərəkətdir. – Dünyada yaltaqlıq nə olduğunu Mirzə bilməzdi*. Ə.Haqverdiyev. *Sona xala yalan, yaltaqlıq, alçaqlıq sevməz .. bir qadın idi.* S.S.Axundov. *Hərəkətlərdə də, sözlərdə də ürəkbulandırıcı bir yaltaqlıq və gizli bir vahimə müşahidə edən Firidun titrəməyə başladığını hiss etdi*. M.İbrahimov.

**YALTAQ-YALTAQ** *zərf* Yaltaqlıq edərək; yaltaqlana-yaltaqlana; yaltaqcasına. *Yaltaq-yaltaq danışmaq. Yaltaq-yaltaq gülmək. – Qazı yaltaq-yaltaq Teymura tərəf ikiqat əyilərək deyir..* "M.N.lətif."

**YALVARIB-YAXARMA** "Yalvarıb-yaxarmaq"dan *f.is.*

**YALVARIB-YAXARMAQ** *f.* Həddindən artıq yalvarmaq, çox yalvarıb xahiş etmək. *Ənvər yalvarıb-yaxardı. Müşkünazın qarşısında diz çöküb dil çıxartdı, tövbə eləyib üzr istədi.* Ə.Vəliyev.

**YALVARIB-YAPIŞMA** "Yalvarıb-yapışmaq"dan *f.is.*

**YALVARIB-YAPIŞMAQ** *f. dan.* Yalvarıb əl çəkməmək, həddindən artıq yalvarmaq. *Qarı gəldi darvazanın ağzına. Qəssaba çox yalvarıb-yapışdı. Axırda qəssabın ona yazığı gəlib içəri buraxdı.* (Nağıl).

**YALVARICI** *sif.* Yalvarmaq tərzində olan; xahişedici. *Yalvarıcı səs. Yalvarıcı baxışlar. Yalvarıcı nəzərlə. Yalvarıcı tonda.*

**YALVARIŞ** *is.* Yalvarma, yalvarıb-yaxarma, yalvarmaq tərzində olan xahiş. *Qulaqlarımda Qönçənin iniltiləri, çığırtıları, yalvarışları eşidilirdi.* S.Hüseyn.

**YALVARIŞMA** "Yalvarışmaq"dan *f.is.*

**YALVARIŞMAQ** *qarş.* Yalvarmaq (çoxları haqqında).

**YALVARMA** "Yalvarmaq"dan *f.is.*

**YALVARMAQ** *f.* Birinin könlünü yumşaldıb bir şeyə razı etmək üçün öz nəfsini alçaldaraq təkidlə acizanə xahiş etmək, rica etmək. *Çox yalvardı, bir şey çıxmadı.* – [Koroğlu] *ağlamayan, yalvarmayan düşməni öldürməzdi, bağışlayardı.* "Koroğlu". *Evimizdən ayrılanda çox da tələsmirdim, amma xalamın yalvarmağı yadıma düşəndə bir qədər ayaq götürdüm.* C.Məmmədquluzadə. *Bu halda – Şərifə* [Zeynalın] *qarşısında diz çöküb ağladığı halda, yalvaran bir vəziyyət aldı.* S.Hüseyn.

**YALVARTMA** "Yalvartmaq"dan *f.is.*

**YALVARTMAQ** *icb.* Yalvarmağa məcbur etmək.

**YALVAR-YAXAR** 1. *is.* Yalvarış, çox yalvarma. *Şeyda .. xeyli yalvar-yaxardan sonra bir-iki ağız oxumaqla kifayətlənərdi.* M.Hüseyn.

2. *zərf* Yalvarmaqla, xahişlə, çox yalvardıqdan sonra. *Bakıda səsi olan bütün adamlar yalvar-yaxar bu işə cəlb edildi.* S.Rəhman. *Anasını yalvar-yaxar xörək yeməyə razı edəndən sonra .. Veys getməyə tələsirdi.* Ə.Əbülhəsən. ☐ **Yalvar-yaxar etmək (eləmək)** – çox yalvarmaq. [Hacıyev] *bölüyə getmək əvəzinə təzədən bir də kapitana müraciətlə yalvar-yaxar edib bu təyinatdan yaxasını qurtarmağa təşəbbüs edəcəkdi.* Ə.Əbülhəsən.

**YALVAR-YAPIŞ** b a x **yalvar-yaxar**. *Bir çox yalvar-yapışdan sonra bunları buraxırlar saraya.* "M.N.lətif." *Aynanın yalvar-yapışlarına .. baxmayaraq, o, Mirzəni sakit bir yola qaytara bilməmişdi.* S.Rəhimov. // Zərf mənasında. *Sonra arvadı, qızı, oğlu gedib* [mollanı] *yalvar-yapış gətirərlərmiş.* "M.N.lətif." *Müxtəsər, qarı ayağa durdu, yalvar-yapış qızı razı elədilər.* (Nağıl). ☐ **Yalvar-yapış eləmək** – çox yalvarmaq, yalvarıb-yaxarmaq. *Qəmər zindanbanı çağırıb yalvar-yapış elədi.* (Nağıl). [Ələmdar] *istədi .. yalvar-yapış eləsin.* S.Rəhimov.

**YAL-YALMAN** *is.* Bəzi heyvanların boynunda olan uzun tüklər; yal. *Hacı kürkünün sol çiynini yuxarı atıb, ata yaxınlaşdı. Onun qaşqasını, yal-yalmanını tumarladı.* Ə.Abasov.

**YAL-YAMAC** *top.* Dağın yal və yamacları. [Kosa] *yal-yamaca baxıb başını qaşıdı, məhəccərə söykənib dərin sükuta getdi və özünə vəzifə seçməyə başladı.* S.Rəhimov.

**YAM** *is. tar.* Orta əsrlərdə monqol işğalına məruz qalmış ölkələrdə, o cümlədən Azərbaycanda mövcud olmuş nəqliyyat və rabitə məntəqəsi (rus dilində işlədilən "yamşik" sözü də buradandır).

**YAMAC** *is.* Dağın, təpənin ən yüksək nöqtəsindən aşağıya mayili səthi. *Dağ yamacı. Yamaca qalxmaq.* – *Sürü-sürü qoyunları çoban yamacda otladar; Alar ələ papağını, oxur şikəstə, fit çalar.* A.Səhhət. *Naltökən dağları yel kimi keçər; Hər zümrüd yamacdan bir çiçək seçər.* S.Vurğun. *Güney yamaclarda yerləşən şəhər bu gün lap tez yuxudan qalxmışdı.* Mir Cəlal.

**YAMACLI** *sif.* Yamacı olan. *Sakit liman şimaldan sıldırım qaya ilə, qərbdən və cənubdan yastı yamaclı alçaq dağlarla araya alınmışdı.* M.Süleymanov.

**YAMACLIQ** *is.* Yamaclı yer, yamaclar çox olan yer.

**YAMAQ** *is.* 1. Bir şeyin cırıq və ya yırtıq yerini qapayıb örtmək üçün həmin (və ya başqa) materialdan oraya tikilən və ya yapışdırılan qumaş və s. parçası. *Yamaq salmaq.* – *..Bu gəncin əynində boz rəngə çalan paltar, ayaqlarında bir-iki yerindən yamağı görünən yumşaq gürcü çəkməsi vardı.* S.Rəhman. *Mürşüd kişi köhnə, qara şal pencəyinin ətəyini*

*yuxarı qaldırıb üst köynəyinin yamağını göstərdi.* Ə.Vəliyev.

2. *məc.* Yamaq kimi görünən, ümumi ahəngi, səliqəni pozan, uymayan, yaraşmayan, yersiz, lüzumsuz əlavə, əlavə edilmiş şey. *Məqalənin bu yeri yamaq kimi görünür.*

**YAMAQÇI** *is.* Yamaq yamamaqla məşğul olan adam; pinəçi. *Ayaqqabıları yamaqçıya ver.* // Paltaryamayan. [Əntiqənin] *böyüyü-zadı yoxdur, iki il olar ki, atası yatalaqdan öldü, anası da ki sağınçıdı, yamaqçıdı.* Mir Cəlal.

**YAMAQLAMA** "Yamaqlamaq"dan *f.is.*

**YAMAQLAMAQ** *f.* Bir şeyin cırıq və ya yırtıq yerini yamaqla qapamaq, yamaq vurmaq; yamamaq.

**YAMAQLANMA** "Yamaqlanmaq"dan *f.is.*

**YAMAQLANMAQ** *məch.* Yamaq vurulmaq.

**YAMAQLATMA** "Yamaqlatmaq"dan *f.is.*

**YAMAQLATMAQ** *icb.* Bir şeyə yamaq vurdurmaq.

**YAMAQLI** *sif.* Yamağı və ya yamaqları olan, yamaq vurulmuş; yamanmış. *Yamaqlı paltar. Yamaqlı palaz. – Arvad Cumanın .. yamaqlı çəkməsini geydi.* Ə.Əbülhəsən. [Qəhrəmanın] *paltarı boz şal pencəklə yamaqlı qara şalvardan və sağanağı tamam bozarmış bir köhnə papaqdan ibarət idi.* Ə.Vəliyev.

**YAMAQLIQ** 1. *sif.* Yamaq üçün yararlı. *Yamaqlıq dəri* (*parça*).

2. *is.* Yamaq. *Savadın əlində köhnə bir dəsmal; Yamaqlıq salınmış çox yerdən xal-xal.* H.K.Sanılı.

**YAMAQSIZ** *sif.* Yamağı olmayan, yamaqsız ayaqqabı.

**YAMAQ-YAMAQ** *sif.* Başdan-ayağa yamaqlı, hər yerinə yamaq vurulmuş. *Yamaq-yamaq şalvar. – Sanırsan ki, indi yıxılacaqdır; Əynində paltarı yamaq-yamaqdır.* S.Rüstəm.

**YAMAQ-YIRTIQ** *is.* Yamanması lazım olan hər şey, yamanmalı paltar və s. *Arvad kişinin yerini saldıqdan sonra taxçanı-boxçanı axtarıb yamaq-yırtığını tikərdi.* H.Sarabski.

**YAMAMA** "Yamamaq"dan *f.is.*

**YAMAMAQ** *f.* 1. Bir şeyin cırıq və ya yırtıq yerini təmir etmək. *Şalvarın dizlərini yamamaq. Corabları yamamaq. Çəkməni yamamaq. – Yamayardım babamın çul-çuxasın.* M.Ə.Sabir. *Salatın üstünə ala-bəzək çaynik qoyulmuş samovarın yanında oturub əlində nə isə yamayırdı.* M.Hüseyn.

2. *məc. dan.* Uymadığı halda bir şeyə əlavə etmək, artırmaq, yapışdırmaq. [Faytonçu:] *Özün bilirsən ki, taksı beş şahıdır. Məndən iki şahı kəsib harana yamayacaqsan?* Ə.Haqverdiyev. [Möhsün:] *Musa, gətir, bu kökdə şəklimizi çəkdir. Lazımın olar, filmlərin birinə yamayarsınız.* Mir Cəlal.

**YAMAN** *sif.* 1. Pis. *Yaman arvadlının evi cəhənnəmdir.* (Ata. sözü). *Biçarə münəccimbaşı yaman* (z.) *halda idi.* M.F.Axundzadə. *Bu dünyada üç şey başa bəladı; Yaman oğul, yaman arvad, yaman at.* Aşıq Ələsgər. *Saldız axırda yaman halə məni.* M.Ə.Sabir.

2. Rəhmsiz, insafsız, əzazil. *Yaman adamdır, onunla ehtiyatlı ol. – Kərəm kimi mən oduna yananam; Dostuna dost, düşməninə yamanam.* Aşıq Əziz.

3. *məc.* Təsiri şiddətləndirmək üçün bəzən "çox", "həddindən artıq", "bərk", "tez", "şiddətli" kimi mənalarda işlənir. *Yaman işə düşmüşdüm. Bu gün yaman istidir. – Qara Pəhləvan yaman güclü, həm də yaman əyyar idi.* "Koroğlu". *Bu davadan sonra iki məhəllənin arası daha da yaman pozuldu.* N.Nərimanov. *Ey könül, fürsəti badə vermə gəl; Gün keçir, ay keçir, il yanan gedir.* M.Rahim. // Bəzən "çox yaxşı", "əla" mənasında işlənir. *Yaman atandır. Yaman çalır. Yaman qoçaqdır.*

4. *is.* Qarğış. *Məhəmmədhəsən əmi Əhməddən eşşək necə olmağını soruşan kimi İzzət uca səslə onun üstə qışqırıb başladı yamanı.* C.Məmmədquluzadə.

5. *tib.* Həyat üçün təhlükəli, çox qorxulu, xətərli, zərərli, pis. *Yaman şiş. Yaman yara.* // *dan.* İs. mənasında. *Dilərəm üzünə çıxsın bir yaman; Müdam zəhər olsun alnı namərdin.* (Qoşma).

◊ **Yaman demək** – söymək. *Şaban nənə Əsədi qabağına salıb yaman deyə-deyə* (z.) *gedir.* C.Məmmədquluzadə. **Yaman dəymiş** – qarğış ifadəsi. *Alo kişi .. yabının yox olduğunu gördü: – Əşi, bu yaman dəymiş hara əlli-ayaqlı itdi.* S.Rəhimov. **Yaman göz** – gözdə, baxışda bədbəxtlik gətirən əsrarəngiz sehirli qüvvə. *Yaman gözə şeşələnən buynuz hədəfə; Bu daş çoxdan atılmışdı; İndi*

*çatırdı.* M.Araz. **Yaman gün** – 1) pis gün; ağır, əziyyətli, məhrumiyyətlərlə dolu vəziyyət. *Yaman günün ömrü az olar*. (Ata. sözü); 2) ağır vəziyyət (hal), pis vəziyyət. *Fətulla .. yaman gündə yatırdı.* Mir Cəlal. **Yaman günə (hala, kökə) düşmək** – səhhətcə, zahiri görünüşcə, yaxud maddi vəziyyətcə pis hala düşmək. *Su tükəndi sənəkdən; Sənək sındı biləkdən; Bir yaman günə düşdüm; Qurtarmadım kələkdən.* (Bayatı). **Yaman günə salmaq** – korlamaq, xarab etmək, pis hala (vəziyyətə) salmaq. *Yaxşılığı əlimizdən alıblar; Yaxşı bizi yaman günə salıblar*. Şəhriyar. **Yaman olmaz** – pis olmaz, yaxşı olar. [Hüseyn:] *Gedib ona bir baş çəksən, yaman olmaz*. Qantəmir. **Yaman yerdə axşamladıq** – gözlənilmədə, çətin, çıxılmaz, təhlükəli vəziyyətə düşdükdə deyilən ifadə. [Əlibala] *əsəbi bir halda başını bulayıb deyindi: – Yaman yerdə axşamladıq!* M.Süleymanov.

**YAMANCA** *sif.* 1. Yaman, pis. *Aşıq yamanca deyil; Xalın yamanca deyil; Günümüz belə keçsə; Yenə yamanca deyil.* Sarı Aşıq.

2. Çox, olduqca. [Hacı Fərəc:] *..Hər nə isə, yamanca şeytandır*. N.Vəzirov. // Zərf mənasında. *Yoxuşun tən ortasında, qırıldı boyunduruq; Yamanca qaldınız boynuburuq*. O.Sarıvəlli.

3. *is.* Yaman, pis adam, şey və s. *Yamanca, sən dur burada, mən yaxşıcanı tapınca*. (Ata. sözü).

**YAMANLAMA** "Yamanlamaq"dan *f.is.*

**YAMANLAMAQ** *f.* 1. Pisləmək, töhmətləndirmək, pisinə danışmaq. *..Yazıq məşədilər, gündə sizi qəzetlərdə yamanlayırlar ki, siz cümə günləri dükanları açıb alış-veriş eləyirsiniz.* C.Məmmədquluzadə. // Danlamaq, söymək, biabır etmək. *Günlərin birində bəyin bığıburma cavan oğlu at belində xırmana gəldi və Ramazanın atasını məhsulu gizlətməkdə təqsirləndirib yamanlamağa başladı*. M.Hüseyn.

2. *dan.* Yaman yara çıxarmaq (b a x **yaman** 5-ci mənada).

**YAMANLAŞMA** "Yamanlaşmaq"dan *f.is.*

**YAMANLAŞMAQ** *f.* Pisləşmək, xarablaşmaq, daha da pis olmaq.

**YAMANLI** *sif. məh.* Yaman şişi (yarası) olan (b a x **yaman** 5-ci mənada). *Yamanlı at.*

**YAMANLIQ** *is.* Pis iş; pislik. *Yaxşılığa yaxşılıq hər kişinin işidir; Yamanlığa yaxşılıq ər kişinin işidir*. (Ata. sözü). *Yaxşılıq yamanlığın qalxanıdır*. (Ata. sözü). □ **Yamanlıq etmək** – pislik etmək. *Etdi bu fələk hər kəsə bir tövr yamanlıq*. M.Ə.Sabir. [Turac:] *Mən soruşmaq istəyirəm ki, mən sənə nə yamanlıq etmişdim?* C.Cabbarlı. [Biri:] *Sən ona yamanlıq etməkdə böyük səhv edirsən*. S.Hüseyn.

**YAMANMA** "Yamanmaq"dan *f.is.*

**YAMANMAQ** 1. *məch*. Yamaq salınmaq (vurulmaq), calaq salınmaq. [Minayə] *..bəzi yeri bir neçə dəfə yırtılıb yamandığına görə, hava buraxan körüyünə diqqət edirdi.* Ə.Əbülhəsən.

2. *t-siz. məc.* Yapışmaq, yapışıb ayrılmamaq (qopmamaq).

**YAMANMIŞ** *f.sif.* Yamaq vurulmuş (tikilmiş); yamaqlı. *Şalvarın yamanmış dizləri. Yamanmış köynək. Yamanmış paltar.*

**YAMAN-YAXŞI** *zərf* Birtəhər, güc-bəla ilə; nə pis, nə yaxşı. *İşi yaman-yaxşı görüb qurtardıq*. – [Hacı Mehdi:] *Allaha şükür, görürsən, beləcə, yaman-yaxşı dolanırıq*. Ə.Haqverdiyev.

**YAMAN-YAMAN** 1. *sif.* Böhtançı, şər, pis. [Sitarə:] *Allah sizi saxlasın yaman-yaman dillərdən*. C.Cabbarlı.

2. *zərf* Pis-pis. *Yaman-yaman danışmaq.*

**YAMATDIRILMA** "Yamatdırılmaq"dan *f.is.*

**YAMATDIRILMAQ** *məch*. Başqası vasitəsilə yamatmaq. *Ayaqqabıların hamısı yamatdırılmışdır*.

**YAMATDIRMA** "Yamatdırmaq"dan *f.is.*

**YAMATDIRMAQ** *icb*. Başqası vasitəsilə yamatmaq, başqasına yamatmaq. *Ayaqqabıları yamatdırmaq*.

**YAMATMA** "Yamatmaq"dan *f.is.*

**YAMATMAQ** *icb*. Başqasına yamaq vurdurmaq, yamaq işi gördürmək. *Corabı yamatmaq*.

**YAMSILAMA** "Yamsılamaq"dan *f.is.*

**YAMSILAMAQ** *f.* Başqasının danışığını, hərəkətlərini və s.-ni mümkün qədər eyni ilə təkrar etmək; təqlid etmək. [Təlxək] *üzünə dəridən bir üzlük taxıb aşağıda oyun çıxarar və yamsılamaqla pul yığardı*. H.Sarabski. *Hüseyn bu dərvişləri o qədər gözəl yamsılayardı*

*ki, qonşu arvadlar tamaşaya yığılardılar.* S.Rəhman.

◊ **Ağzını yamsılamaq** – yamsılayıb, təqlidini çıxardıb acıqlandırmaq, hirsləndirmək.

**YAMSILANMA** "Yamsılanmaq"dan *f.is.*

**YAMSILANMAQ** *məch*. Təqlidi çıxarılmaq.

**YAMSILATMA** "Yamsılatmaq"dan *f.is.*

**YAMSILATMAQ** *icb*. Yamsılamağa məcbur etmək.

**YAMŞAQ** bax **yaşmaq**. *Məni görüncə* [Mələk] *..donub, yamşağı ağzına çəkib qönçə dəhanını gizlətdi.* A.Divanbəyoğlu.

**YAMŞAQLI** bax **yaşmaqlı**.

**YAMŞANMA** "Yamşanmaq"dan *f.is.*

**YAMŞANMAQ** bax **yaşmanmaq**.

**YAMŞIMAQ** bax **yaşınmaq**.

**YAM-YAM** *is.* İnsan əti yeyən vəhşi. // Vəhşi, adamyeyən. [Şeyda:] *Sakit ol, anacan, Mudrov nə adamyeyəndir, nə yam-yam.* Ə.Məmmədxanlı. *Kulak pusquda durur gecə yam-yamlar kimi baxır*. S.Rüstəm.

**YAMYASTI** *sif.* Çox yastı olan, tamamilə yastı vəziyyətdə olan.

**YAMYAŞIL** *sif.* Tamamilə yaşıl, çox yaşıl. *Yamyaşıl parça. Yamyaşıl boya*. // Tamamilə göyərib yaşıllaşmış. *Yamyaşıl tarlalar. Yamyaşıl bostan. – Oldu yenə yam-yaşıl* (z.) *ağaclar; Dağlar, təpələr, bütün yamaclar*. A.Şaiq. *Mən qarşımda yamyaşıl çöllər görürəm; Qeyrətli, bacarıqlı ellər görürəm*. M.Müşfiq.

**YAN** *is.* 1. Tərəf, ətraf. *Yanlarda düşmən qalmamışdı*. H.Nəzərli. [Güldəstə:] *Məktub bu yandadı*. H.Seyidbəyli. □ **Yan almaq** – yanaşmaq, yaxınlaşmaq, yaxın durmaq. [Rəsul] *yan alıb lotubaşıdan xəbər aldı: – Əmi, bu kağızlar nə olan şeydir?* "Aşıq Qərib". *Bu zaman qatar sürətini azaldıb fit verə-verə stansiyaya yan aldı*. A.Şaiq. *Hamı ağır bir yük altından çıxıb yüngülləşmiş kimi danışa-danışa otaqdan çıxanda, Tahir anasına yox, kolxoz sədrinə yan aldı*. M.Hüseyn. **Yan vermək** – yanaşmaq. *Bir kərə qan bu mətləbi, xalqa ziyan verirsiniz; Molla gedir yemək üçün, siz ona yan verirsiniz*. C.Cabbarlı. **Dörd (bir) yandan** – hər tərəfdən, dörd tərəfdən. [Kərəm:] *Coşqun boran alıb dörd bir yanımı; Soyuq kəsib iliyimi, qanımı.* "Əsli və Kərəm". *Hər gölməçənin dörd yanına torpaqdan sədd çəkilmişdir*. M.Hüseyn. // Yer mənasında. *Heç bir yanda yoxdur*. // Yön, istiqamət. *Bu yandan getdi.*

2. Bədənin çiyinlərdən buda qədər olan sağ və ya sol hissəsi; böyür. [Mehriban] *yanı üstə çevrildi.* S.Hüseyn. *Ballı .. kürsü çəkib ..* [Qara kişinin] *yanında oturdu*. Ə.Əbülhəsən. *Vəzirov yenə də aciz və yazıq bir görkəm alıb, boynunu yana sarı əydi.* M.Hüseyn.

3. Sağ və ya sol tərəfdə olan. *Yan cib. Yan küçə*. – [Qəhrəman:] *Siz gözüaçıq olun, – deyə yoldaşlarıma tapşırdım və yan otağa getdim.* H.Nəzərli. □ **İki yanında** – sağında və solunda. Bu yanında, ... o yanında – sağında, solunda. [Məşədi İbad:] *Qəribə yerdəyəm, vallah, bir gözəl o yanımda, bir gözəl bu yanımda*. Ü.Hacıbəyov.

4. Kənar, qıraq. *Hacı Qulu .. ehtiyatla quyunun yanına uzanıb diqqətlə baxdı*. A.Şaiq. *Evin dibində yanının nazik dəmirləri qopmuş, taxtasının şirəsi çoxdan getmiş bir sandıq .. vardı.* M.İbrahimov. [Qərənfil xala] *göndəriləcək şeyləri bir yana yığdı.* Ə.Vəliyev. □ **Yan eləmək** – kənara itələmək. *Səkinə, qızın qollarını yan elədi*. M.İbrahimov. *Çalsaqqal kişi .. adamları yan eləyib .. elə bil vahimə içində sağa-sola yüyürürdü*. Mir Cəlal. **Yana durmaq** – kənara çəkilmək, uzaq dayanmaq. *Göydə mələklər yana durdu; Mələklər də sana durdu*. Qurban. **Yandan çıxmaq** – nagah, gözlənilmədən, birdən gəlmək, görülmək, ortaya çıxmaq. **Bir yana atmaq** – laqeyd münasibətlə kənar etmək.

5. Sağrı, oturacaq. *Çox çəkmədi ki, Mirzə Süleyman yanını ovuşdura-ovuşdura qapıdan çıxdı*. B.Talıblı. [Cavad] *yarımkürkünün yaxasını açaraq yanını ağac kötüyünün üstünə qoydu.* Ə.Vəliyev. □ **Yanı yer görməmək** – bir yerdə oturmamaq, daim ayaq üstə olmaq, yerimək. *Əntiqənin yanı yer görmürdü. Səhərdən axşamacan evdə məşğul idi*. Mir Cəlal. **Yanını basmaq** – dümsükləmək, dümsüklə işarə etmək. *Alagöz bir qız, Gülsümün yanını basdı*. M.İbrahimov. **Yanını çəkmək** – axsamaq, taytımaq. **Yanını yerə qoymaq (vermək)** – oturmaq. [Həsən:] [Tubu] *gəl, bir yanını yerə qoy, gör nə deyirəm.* Ə.Haqverdiyev. [Vəli:] *..Çək sürünü keyfin hara istəyir, .. özün də yanını ver yerə; al tütəyi əlinə, vəssalam*. N.Vəzirov.

6. Bilavasitə yaxınlıq, birgəlik bildirir. *Yanında dostlarından iki nəfər dəxi var idi, onun söhbətinə qulaq asırdılar.* M.F.Axundzadə. [Ziba] *çox gecələri* [Əsmərin] *yanında yatırdı.* S.Hüseyn. [Həbib bəy:] *..Zəhmət çək, hacının yanına minnətə get.* S.Rəhman. □ **Yanına almaq** – yaxınlığına gətirmək. *Vahid uşağı yanına alıb oynadır, dilə tutub yatırtmaq istəyirdi.* Mir Cəlal. **Yanına çəkmək** – öz tərəfinə gətirmək. *Hər kəs öz yarını çəkib yanına; O ki mənəm elə həsrət çəkirəm.* Q.Zakir. **Yanına düşmək** – birlikdə getmək. *Molla taytıya-taytıya düşür bunların yanına.* "M.N.lətif." *Gəldiyev "gedək" – deyə Rübabənin yanına düşdü.* Mir Cəlal. **Yanına salmaq** – özü ilə aparmaq. *Sabah ertə böyük bağımızı gəzmək bəhanəsi ilə Məmmədrzanı yanıma salıb getdim.* S.S.Axundov. [Müəllim] *bir gün Mayisi yanına salıb Qaçaygilə getdi.* Ə.Vəliyev. **Yanında saxlamaq** – özü ilə birlikdə, özündə saxlamaq. *Gətirmişdin sən Zakiri əmanə; Derdi, gedəcəyəm kuyi-canana; Xeyir görsün, istər düşsün ziyanə; Yaman-yaxşı saxla bari yanında.* Q.Zakir. **...dan** // **...dən bu yana** – ...dan ...dən bu vaxta qədər. *Amma arvadların bu dərəcə həyasızlıqlarını .. dünya yaranandan bu yana heç eşidibsinizmi?* C.Məmmədquluzadə. *Nə var ki, unutmuşam paltosunu tutmağı; O axşamdan bu yana açılmır qaşqabağı.* S.Rüstəm. **Öz yanından** – 1) guya; 2) öz bildiyi kimi, özündən. *Məşədi bəy student qızın adını öz yanından uydururdu.* M.Hüseyn. **Fikri (xəyalı)... yanında olmaq** – diqqəti ...də olmaq. *Ramazanın əvvəlinci günündən müsəlmanların fikir və xəyalı cücəplov yanındadır.* C.Məmmədquluzadə. [Qərənfil xalanın] *bütün xəyalı bu saat cəbhədə olan nəvəsi İldırımın yanında idi.* Ə.Vəliyev.

7. **Yanında, yanımda** şəklində: iki müqayisə obyektindən birinin digərindən üstünlüyünü bildirir. *Onun yanında bu heçdir.*

◊ **Yan baxmaq** – bəyənməmək, həqarətlə baxmaq, pis münasibət bəsləmək. [Altay:] *And olsun vicdana, bu gündən sonra; Hər kim yan baxarsa bu yoxsullara; İldırımlar partlayacaq başında; Adı yazılacaq məzar daşında.* H.Cavid. **Yan gəzmək** – görüşmək istəməmək, uzaq gəzmək. *Bilmirəm ki, neyləmişəm canana; Hər görəndə məndən belə yan gəzər.* Məhəmməd bəy Aşıq. **Yanını kəsmək (kəsdirmək)** – əl çəkməmək, ayrılıb getməmək. *Dərdü qəmü möhnət kəsib yanımı; Qoymaz yerə düşə, içər qanımı.* Q.Zakir. *Vəfalı Hüsniyyə rəfiqəsinin yanını kəsdirib sübhə qədər gözlərini yummadı.* S.S.Axundov. **Yanlarını qapmaq** – çox hirslənmiş, qəzəblənmiş adam haqqında. *Həmin axşam Həsənəlinin evində ümumi bir övqattəlxlik vardı. Tərlan xanım yanlarını qapırdı.* Mir Cəlal. **Bir yana çıxartmaq** – 1) həll etmək, bir nəticəyə gəlmək. *Bu barədə yoldaşlarımıznan çox fikirləşdik, fikirləşdiksə də, bir yana çıxarda bilmədik.* C.Məmmədquluzadə; 2) tərbiyə vermək, böyütmək. **Bir yana çıxmaq** – həyatda öz yerini tapmaq. **Bir yandan**..., **o biri yandan**... – mütəmadiyən, həmişə. *Çürümüş parçanın dəxi faydası yoxdur: bir yandan yamadın, o bir yandan cırılacaq.* C.Məmmədquluzadə. ...**o yana qalsın (dursun)** – "başqa", "əlavə" mənasında. *Hər şey o yana qalsın,* [Sara xanımın] *on iki taxtadan kəsdiyi məxmər tumanı dövrhadövr dörd barmaq enində bafta olurdu.* Qantəmir.

**YANA** *qoş. dan.* 1. Ötrü, üçün, üzündən (səbəb bildirir). *Ta kim məqami tərk edəndə; Səndən yana əzm edib gedəndə.* Füzuli. *Əşi, sən niyə bu acgöz kağızdan yana belə cinli olmusan?* S.Rəhimov. *Qonaq duruxdu: – Nədən yana soruşdun?* Mir Cəlal.

2. ...barədə, ...cəhətdən, ...tərəfdən. [Hacı Həsən:] *Şeyxəna, doğrusu, mən övladdan yana bədbəxt olmuşam.* C.Məmmədquluzadə.

**YANACAQ** *is.* 1. Yandıqda istilik, alov verən hər şey (odun, kömür və s.). *Yanacağı bol olanlar buxarılarını qalamış, təndirlərini yandırmış, evlərini isidib ailələrinin başını bir yerə yığmışdılar.* Ə.Vəliyev.

2. *tex.* Motor və mühərriklərin işləməsi üçün lazım olan maddələr (neft, benzin və s.). *Yanacaq sənayesi. Yanacaq qazı. Traktorlar üçün vaxtında yanacaq gətirmək.*

**YANACAQLI** *sif.* Yanacağı olan, yanacaqla işləyən.

**YANACAQSIZ** 1. *sif.* Yanacağı olmayan.

2. *zərf* Yanacaq olmadan. [Mehriban Zeynalın] *işsiz qaldığı günlərində aclığını, çılpaqlığını açıb söyləmədiyi kimi, bir çox qış*

*gecələrini yanacaqsız keçirmiş, şikayət etməmişdi.* S.Hüseyn.

**YANACAQSIZLIQ** *is.* Yanacaq yoxluğu, yanacaq qıtlığı, yanacaq olmadığı vəziyyət və şərait. *Traktorlar yanacaqsızlıq üzündən işsiz durmuşdur.*

**YANAKI** *zərf* 1. Yan tərəfə çevrilmiş vəziyyətdə, yan tərəfini irəli verərək, çiynini irəli verərək, böyrünü qabağa verərək, yarıdönmüş halda. *Yanakı üzmək. – Faytonçu Əhməd atların başını çəkər, yanakı oturar, köks ötürüb Əntiqənin taleyini miniklərinə danışardı.* Mir Cəlal. *Bayram yanakı durub sağ qulağını pəncərəyə söykəyəndə bu sözləri eşitdi: – Çörəyin arasında kağız var.* M.Hüseyn. // Bir qulağının üstünə, başının bir tərəfinə çəkərək. *Tüklü papağını qoyub yanakı; Baxır öz bəxtinə ayna sularda!* S.Rüstəm.

2. Başını yana çevirmədən, gözləri ilə əyri-əyri. *Yanakı baxmaq. – Araz başını qaldırıb Əhmədi yanakı süzərək: – Atabala mənim atam deyil, babamdır! – dedi.* A.Şaiq. [Bəyim] *yanakı üzümə baxaraq gülümsədi.* İ.Əfəndiyev.

**YANAQ** *is.* Üzün almacıq sümüyündən çənəyə qədər olan qismi. *Yanağından öpmək. Qırmızı yanaq. – Yanaq üzrə saçın tavusa bənzər; Ki, seyri cənnətül-məvayə düşmüş.* Nəsimi. [Muradın] *fikrində gəzib dolaşan Nigar idi. O Nigar ki gülümsərkən yanaqlarında ufacıq çuxurlar əmələ gələr, üzü qızarardı.* S.Hüseyn. *Narınc bütün bədənindəki qanın yanağına hücum etdiyini hiss elədi.* S.Rəhman. ☐ **Yanaqlarından qan damır** – sağlam, dolğun, qırmızıyanaq adam haqqında. [Səməd Bayramlı:] *Əmioğlu, maşallah, lap kökəlmisən, yanaqlarından qan damır.* M.Hüseyn.

**YANAQLI** Adətən yanağın övsafını təyin edən sifətlərə qoşularaq işlənir. *Bir-birinə həmdəm iki növcavan; Biri güldür, biri gülgəz yanaqlı.* M.P.Vaqif.

**YANAR** *sif.* Odpüskürən, alovsaçan, atəşsaçan, odsaçan, odlu. // Alışqan, tezodlanan, tezalışan, tezyanan. *Yanar maddələr.*

◊ **Yanar dağ** – 1) vulkan. *Vezuvi adlı yanar dağın lavası altında Qerkülazm və Pompey şəhərləri basdırılıb, heç bir əsərləri qalmamışdır.* F.Ağazadə; 2) *məc.* simvolik mənada. *Bir parça atəşəm, bir parça yanğın; Qəlbim örpəyidir yanar bir dağın.* M.Müşfiq. **Yanar oda salmaq** – bəlaya salmaq, dərdə salmaq, çox ağır, iztirablı, əziyyətli vəziyyətə salmaq. [Səlimnaz xanım:] *Ay sənin qardaşların qırılsın, .. məni yanar oda saldığın yerdə.* N.Vəzirov.

**YANAR-YANAR** *sif.* Yanmaqda olan. *Yenə məni yanar-yanar odlara; Dağılmış ayrılıq saldı, sevdiyim!* M.V.Vidadi.

**YANAŞDIRILMA** "Yanaşdırılmaq"dan *f.is.*

**YANAŞDIRILMAQ** *məch.* Yaxınlaşdırılıb dirədilmək, yan-yana edilmək (qoyulmaq), kip yaxınlaşdırılmaq.

**YANAŞDIRMA** "Yanaşdırmaq"dan *f.is.*

**YANAŞDIRMAQ** *f.* Yanbayan etmək, kip yaxınlaşdırmaq, yanbayan qoymaq, yaxınlaşdırıb birləşdirmək, bir-birinə dirəmək. *Stolları bir-birinə yanaşdırmaq. – Ağsaqqal kişi çubuğunu söndürdü. Qatırları yanaşdırdı.* Mir Cəlal.

**YANAŞI** *zərf* 1. Bir-birinə yaxın vəziyyətdə, bir-birinin yanında; yanbayan, yan-yan. *Yanaşı oturmaq. Yanaşı qoymaq. Yanaşı getmək. Yanaşı durmaq. – Qoca usta Lətifə ilə salamlaşıb şoferlə yanaşı oturdu.* M.Hüseyn. *Eldarla mənim yerim yanaşı salınmışdı.* İ.Əfəndiyev. // Həmhüdud, həmsərhəd.

2. Bərabər, eyni zamanda. *Bununla yanaşı.*

**YANAŞIQ** *zərf* Yanaşı, bitişik; yanaşmış, bitişmiş vəziyyətdə.

**YANAŞIQLIQ** *is.* Yanaşı olma, yanbayan olma; bitişiklik.

**YANAŞILMAZ** *sif.* 1. Yanaşmaq, yaxınlaşmaq mümkün olmayan, yanına varıla bilməyən; əlçatmaz. *Yanaşılmaz bir yer.*

2. Yaxınına getmək mümkün olmayacaq dərəcədə sərt və ağır xasiyyətli. *Yanaşılmaz adam.*

**YANAŞILMAZLIQ** *is.* Yanaşmaq, yaxınlaşmaq mümkün olmama; əlçatmazlıq.

**YANAŞMA** "Yanaşmaq"dan *f.is. Əsgərlərin gülərüzlə onlara yanaşması bizim qorxulu olmadığımızı bildirdi.* H.Nəzərli.

**YANAŞMAQ** *f.* 1. Yaxınına, yanına gəlmək; yaxınlaşmaq, yanbayan olmaq. *O, mənə yanaşıb qolumdan tutdu. Birisi ona yanaşıb nə isə dedi. – Fəxrəddin qapıya yanaşmaq üçün heç bir bəhanə əldə edə bilmirdi.* M.S.Ordubadi. *Tamam mənə yanaşıb dedi: – Gələcək-*

*sən, burada şad görüşəcəyik*. S.S.Axundov. *O, Nazlıya yanaşdı, əlini onun çiyninə qoyaraq: – Nazlı! – dedi*. H.Nəzərli.

2. Yan almaq, kip yaxınlaşmaq, yaxınlaşıb dirənmək. *Gəmi körpüyə yanaşdı.*

3. Bir məsələyə və s.-yə bu və ya digər münasibət göstərmək. *İşə ciddi yanaşmaq lazımdır. Müəllifin dediklərinə tənqidi yanaşmalı. – Onlar məsələyə təşkilatın mənfəəti nöqteyi-nəzərindən yanaşdılar, sən isə belə yanaşmadın.* M.S.Ordubadi.

**YANBAŞ: yanbaş atmaq** *dan.* – boyun qaçırmaq, danmaq.

**YANBAYAN** bax **yan-yana**. Yanbayan oturmaq. – *Onda görürsən yıxılıb yanbayan; Bir neçə növrəstə cavan laybalay.* M.Ə.Sabir.

**YANBIZ** *is.* Omba, yan. [Vəli:] *..Başın üçün, Cavad bəy, yanbızına dəyənəyi belə yapışdırdım ki, küçük kimi zingildədi.* N.Vəzirov. *..Əminə əllərini yanbızlarına vurdu.* Ə.Əbülhəsən.

**YANBIZLAMA** "Yanbızlamaq"dan *f.is.*

**YANBIZLAMAQ** *f. dan.* Yanbızı (yanı) ilə itələmək, vurmaq.

**YANCAQ** *is. dan.* Sağrı, yan (bax **yan** 5-ci mənada). *Əli qara öküzün yancağına bir çubuq vurdu.* F.Xoşginabi. ☐ **Yancaq ağrısı** *dan.* – işiasın (oturaq sinir iltihabının) xalq arasında adı.

**YANCAQLAMA** "Yancaqlamaq"dan *f.is.*

**YANCAQLAMAQ** *f. dan.* Yancağından tutmaq.

**YANCİDAR** *zərf* Çox uzağa getməsin deyə heyvanın ipini ayaqlarına sarıma. ☐ **Yancidar etmək** – ipi heyvanın ayaqlarına bu cür bağlamaq. [Dəlilər] *düşüb, atları yancidar eləyib ota buraxdılar*. "Koroğlu". *Qaraqaş düşüb atdan, atını yancidar eləyib oturdu*. (Nağıl).

**YANÇI** *is. məh.* 1. İki küsülü tərəfi barışdıran adam; vasitəçi. *Xülasə, hər iki tərəf yançıların köməyi ilə bir-birinə güzəştə gedib toyu başlayacaqlar.* R.Əfəndiyev. // Köməkçi, havadar. *Əgər yançılar sakit dursaydı, ehtimal ki, bu söz burada qurtarıb gedərdi.* Qantəmir.

2. *məh.* Yanında uşağı olan işçi qadın.

**YANÇILIQ** *is. məh.* İki küsülü tərəfi barışdırma; vasitəçilik. // Kömək, kömək etmə.

**YANDAN** *zərf* Yan tərəfdən, böyürdən. *Yandan keç. Yandan maşın gəlir.*

**YANDI-QINDI: yandı-qındı vermək** *dan.* – ələ salaraq hirsləndirmək, qızışdırmaq, acıqqıcıq vermək.

**YANDIRAN** *f.sif.* 1. Yanğın düzəldən, yanğın salan.

2. Bax **yandırıcı**.

**YANDIRIB-TÖKMƏ** "Yandırıb-tökmək"dən *f.is.*

**YANDIRIB-TÖKMƏK** bax **yandırmaq** 5-ci mənada. *Onun sözləri adamı yandırıb-tökür.*

**YANDIRIB-YAXMA** "Yandırıb-yaxmaq"dan *f.is.*

**YANDIRIB-YAXMAQ** bax **yandırmaq** 5-ci mənada. *Əzizim baxar doymaz; Yandırar-yaxar, doymaz; Baxdıqca gözlərimdən; Qanlı yaş axar, doymaz.* (Bayatı). *Firqət odu məni yandırıb-yaxar; Sübhü şam didəmdən qanlı yaş axar.* Q.Zakir.

**YANDIRICI** *sif.* Yandırmaq xassəsi olan; yandıran, yaxıcı, qızmar. [Günəşin] *yandırıcı şüaları amansızcasına yerə şığıyır(dı).* Ə.Əbülhəsən. *Qoşqar .. yandırıcı dağ günəşinin altında zər kimi bərq vuran balıqları yığmağa başlardı.* İ.Hüseynov. // Məc. mənada. *Yandırdı məni yandırıcı firqəti anın*. Nəsimi. *Heyfa ki bu ali və pakizə hiss* [məhəbbət], *bu yandırıcı atəş bizim qəlbimizdə yoxdur.* F.Köçərli.

**YANDIRILMA** "Yandırılmaq"dan *f.is.*

**YANDIRILMAQ** "Yandırmaq"dan *məch*. *De, bəlkə də od içində bu gecə yarı; Söndürürsən yandırılmış bir xanimanı.* S.Vurğun.

**YANDIRMA** "Yandırmaq"dan *f.is.*

**YANDIRMAQ** *f.* 1. Yanmağına səbəb olmaq; alışdırmaq. *Lampanı yandırmaq. Kibrit yandırmaq. İşığı yandırmaq. Fənər yandırmaq.* – [Xudayar bəy:] *Zəhmət olmasa, bir ispiçkə çək, bu qovu yandırım*. C.Məmmədquluzadə. *Əhməd aralıq peçini yandırdı.* Mir Cəlal. // Məc. mənada. *Ələsgərdi mənim adım; Aləmi yandırar odum.* Aşıq Ələsgər.

2. Şiddətli təsir etmək (isti, qızmar, qaynar şey). *Çay əlimi yandırdı. – O gün hava çox isti idi. Günəş yandırırdı*. A.Şaiq. *Muğan günəşi adamı yandırırdı*. M.İbrahimov.

3. Qaraltmaq, rəngini tündləşdirmək. *Dağ havası adamın üz-gözünü yandırır.* – [Ceyranın] *açıq hava rəngini bir qədər yandırmış, yanaqlarında təbii bir qırmızılıq görünürdü.* S.Hüseyn.

4. Dalamaq. *Gicitkən əllərimi yandırdı.*

5. *məc.* Mənəvi əzab və iztirab vermək, ruhən incitmək, çox ağır təsir etmək. [Səlma:] *Odumu söndürdün, yandırdın məni; Get, kamə yetirməsin Allah səni!* H.Cavid. *Ancaq bir nəfəri Mirzənin vəfatı yandırırdı. O adam Usta Zeynal idi.* Ə.Haqverdiyev.

◊ **Atasını yandırmaq** – b a x **ata**. **Can yandırmaq** – b a x **can**.

**YANDIRTMA** "Yandırtmaq"dan *f.is.*

**YANDIRTMAQ** *icb.* Yandırmağa məcbur etmək.

**YANĞI** *is.* 1. Ürəyi su istəmə, susama, susuzluq, atəş. *Su yanğımı kəsmir. Atlar yanğıdan əldən düşdü.* ◻ **Yanğısını (ürək yanğısını) söndürmək** – su içmək ehtiyacını (su içməklə) rəf etmək, atəşini söndürmək. *Ürək yanğısını söndürmək üçün* [Yunis] *suyu son damlasına qədər başına çəkib ağır bir nəfəs ötürdü.* Mir Cəlal.

2. Yanğın. *Belə od olmaz, böylə alo! Od deyil, yanğı deyil, lovdur, lo!* M.Ə.Sabir.

3. *məc.* Böyük həsrət, şiddətli arzu (adətən "ürək" sözü ilə). [Bayram:] *Mənim ürəyimin yanğısı su ilə sönən yanğıdır?* M.F.Axundzadə. *İsa kişi bunu elə ürək yanğısı ilə soruşdu ki, Xəlil ciddən məyus oldu.* Ə.Əbülhəsən.

4. *məc.* Təsir mənasında.

**YANĞILI** *sif.* 1. Yanğısı olan, susamış.

2. *məc.* Odlu, alovlu, atəşin. *El tazə havalar, yeni sözlər sevir indi; Atəşli könül, yanğılı dillər sevir indi.* Ə.Nəzmi.

**YANĞIN** *is.* 1. Binanı, əmlakı, ümumiyyətlə yana bilən hər şeyi geniş miqyasda qaplayıb məhv edən alov, atəş; habelə yanma prosesinin özü. *Yanğın baş vermək. Yanğını söndürmək. Meşə yanğını. Yanğına qarşı tədbirlər. – Kükrəyib əsdikcə uğursuz külək; Yanğının şöləsi yayılır göyə.* S.Vurğun. *Mədəndə şiddətli bir yanğın vardı.* M.Hüseyn. ◻ **Yanğın dəstəsi** – yanğını söndürmək üçün ixtisaslaşmış şəxslərdən ibarət dəstə. **Yanğın maşını** – yanğını söndürmək üçün qüvvətli nasoslarla təchiz olunmuş maşın (avtomobil).

2. *məc.* Geniş sahələrə yayılan, hər tərəfi qavrayan bir hadisənin güclü təzahürü, inkişafı haqqında. *Müharibə yanğını.*

**YANĞINSÖNDÜRƏN** 1. *is.* Yanğın dəstəsində xidmət edən şəxs, yanğın komandası işçisi. *Rəhim orada dayanan yanğınsöndürənlərə müraciət edərək: – Gedə bilərsiniz! – dedi.* Ə.Sadıq. *Yanğınsöndürənlər dənizdən buruğa şlanqlarla su çəkirdilər.* M.Süleymanov.

2. *is.* Yanğın söndürmək üçün cihaz. *O, bir küncə çəkilib əlində tutduğu yanğınsöndürəni alova tərəf çevirdi.*

3. *sif.* Yanğın söndürmək üçün işlədilən, yanğın söndürməyə məxsus. *Yanğınsöndürən cihaz. Yanğınsöndürən şlanq.*

**YANI** *dan.* b a x **yanakı**.

**YANIB-TÖKÜLMƏK** *f.* 1. Bir haqsızlıq qarşısında və ya başqa bir səbəb üzündən ağır mənəvi əzab və işgəncə keçirmək; yanıb-yaxılmaq.

2. Qibtə etmək, paxıllıq etmək. *Sədr baxdı, baxdı, yandı-töküldü.* Mir Cəlal.

**YANIB-YAXILMAQ** *f.* 1. Ürəkdən heyifsilənmək, çox acımaq, ağır mənəvi əzab və iztirab keçirmək. *Vaqif bu mənzərəyə baxıb düşünür və düşündükcə də yanıb-yaxılırdı.* Çəmənzəminli. *İndi yanıb-yaxılıram; Sərt dilləndim sənə niyə?* M.Dilbazi.

2. *məc.* Aşiq və məftun olmaq, eşq mübtəlası olmaq. *Fərhad Şirin ucundan; Yandı-yaxıldı, ay gözəl!* Aşıq Ələsgər.

3. Acığından, hirsindən boğulmaq, yanıb-tökülmək, bərk hirslənmək. *Alı xan ağa özü yanıb-yaxılır, söyüb-söylənir və muzdurlardan şikayətlənirdi.* S.Rəhimov. *Kişi yanıb-yaxılaraq bu dəfə cavab verməyə söz tapmadı.* İ.Əfəndiyev.

**YANICI** *sif.* Yanmaq xassəsi olan; tezyanan, alışqan. *Yanıcı qazlar.*

**YANIXMAQ** *f. dan.* Yanmaq, çox heyifsilənmək, təəssüf etmək. *Hər ikisi üçün bu iş çox ağır gəlirdi. Alo xüsusən bərk yanıxırdı.* S.Rəhimov.

**YANIQ** 1. *is.* Yanmış şey. *Yanıq qoxusu. Yanıq dadı.*

2. *is.* Od və ya başqa yandırıcı şeyin təsiri ilə bədən toxumasında əmələ gələn zədə. // Yanmaq əsəri, bədənin yanmış yerinin nişanəsi, izi. *Əlinin yanığı. Üzündə bir yanıq var.*

3. *sif.* Susuzluqdan qurumuş, yanmış. *Qurudu Əjdərin yanıq boğazı; Dolandı başına çiçəkli yazı.* H.K.Sanılı. *Yanıq torpaq yandırmışdı hər barını; Qurutmuşdu saplağında ilk baharın novbarını.* M.Dilbazi.

4. *sif. məc.* Dərdli, qəmli, ürəyində dərdi olan; yanıqlı. [Qurban] *tez əlini qoynuna soxdu və məktubu yanıq ürəyi üzərinə sıxaraq yeridi.* A.Şaiq. *Açmayır dərdini qərib bir kəsə; Qulaq verib durur hər yanıq səsə.* Ə.Cavad. *Baxdı anasının yanıq üzünə; Dağınıq saçına, yaşlı gözünə..* H.K.Sanılı.

5. *sif.* Cılız, zəif, sısqa.

◊ **Yanıq vermək** – acıq vermək, acıqlandırmaq, qəsdən hirsləndirmək, qızışdırmaq. *Deyəsən, Rübabə Vahid ilə birləşib Gəldiyevə meydan oxuyur, ya yanıq verirdilər.* Mir Cəlal. **Yanığını çıxartmaq** – acığını çıxarmaq, intiqam almaq.

**YANIQARA** *is. məh.* Heyvanlarda olan bir xəstəlik; sianoz.

**YANIQLI** *sif.* 1. Yanmış yeri olan, yanığı olan.

2. *məc.* Birindən acığı olan, birinə qarşı kini, qəzəbi olan; acıqlı (çox vaxt "əlindən" sözü ilə). *Çoban padşahın əlindən çox yanıqlı idi.* (Nağıl). *Əşi, Fatmanisə xaladan nə yaman yanıqlısan!* S.Rəhimov. *Qızın məktubundan qeyzlənərək; Yanıqlı bir məktub yazdırdı ona.* B.Vahabzadə.

3. *məc.* Kədərli, ələmli, qüssəli, qəmli, həzin; kədər gətirən, təsirli. *Yanıqlı hava. Yanıqlı səs. – Birdən eşitdiyim yanıqlı bir fəryad məni yuxudan ayıltdı.* S.Hüseyn. *Çiçəklərin titrəşib bir-birinə baş-başa gəlmələri elə bil bülbülün yanıqlı səsinə səbəb olurdu.* Çəmənzəminli. *Rəhim bəy yanıqlı bir ah çəkdi.* M.Hüseyn.

4. *zərf* Yanıqlı-yanıqlı, həzin-həzin. *Yanıqlı oxumaq.*

**YANIQLIQ** *is.* Yanıq şeyin halı.

**YANIQLI-YANIQLI** *zərf* Həzin-həzin, kədərli-kədərli; acı-acı. *Yanıqlı-yanıqlı ağlamaq. – Şahsənəm gəlib gördü ki, Qərib yanıqlı-yanıqlı oxuyub ağlayır.* "Aşıq Qərib". *Hərdənbir kəndin üzərindən yanıqlı-yanıqlı çığıran durna dəstələri ötüb keçirdi.* Ə.Məmmədxanlı. *Zurnaçılar yanıqlı-yanıqlı çalırdılar.* S.Şamilov.

**YANILMA** "Yanılmaq"dan *f.is.*

**YANILMAQ** *f.* Bir işi düz görməmək, yanlışlığa, səhvə yol vermək, səhv etmək. *Adam yanıla-yanıla öyrənər.* (Ata. sözü). *Oxşatdım, yanıldım, könül verdim mən; Bilmədən vuruldum, ey dan ulduzu.* C.Cabbarlı. *Yanılmayıramsa o, məzlumluğu sevən, ..səadətini axirətdə arayan dindar, mütəvəkkil bir adam idi.* S.Hüseyn. *Lakin elə birinci həmlədə düşmən yanıldığını başa düşdü.* Ə.Əbülhəsən. // Bir şey və ya adam haqqında yanlış fikirdə olmaq, düzgün təsəvvürü olmamaq. *Yoldaşım haqda çox yanılmışammış. – Səməd təsəvvüründə nə qədər yanılmışdı.* İ.Hüseynov.

**YANILTMA** "Yanıltmaq"dan *f.is.*

**YANILTMAQ** *f.* Çaşdırmaq, aldatmaq, qəsdən fikrini azdırmaq. *Əqlin aldın, yarım, deyin Vaqifin; Yanıltdın əlifin, beyin Vaqifin.* M.P.Vaqif. *Parça alanlar onu yanıldıb cavab verdilər: – Nəbi Sarı yataqdan yazıya çıxdı.* "Qaçaq Nəbi".

**YANILTMAC** *is.* Dil dolaşmadan tez-tez deyilməsi çətin olan söz birləşməsi əsasında qurulan cümlə, ifadə (xalq yaradıcılığının məzəli formalarından biri); məs.: *qırx küp, qırxının da qulpu qırıq küp.*

**YANIMA** "Yanımaq"dan *f.is.*

**YANIMAQ** *f. dan.* Hədələmək. *Bu tərəf o oğlanı yanıdı, düşmən oldular.* A.Divanbəyoğlu. *Elə bil o, kimi isə yanıyırdı.* M.Hüseyn. [Səadət xanım] *üzüklü barmaqları ilə məni yanıyaraq acıqlı-acıqlı baxırdı.* Mir Cəlal.

**YANIMLIQ** *is.* Can yandırma, canıyananlıq göstərmə, biri üçün əlləşib-çalışma. *Düzü, Murtuzaya elədikləri yaxşılıqları görəndən sonra, Gülqədəmə hörmətim birə yüz artdı. Bu ürəkdə, bu yanımlıqda arvad az-az olar.* Ə.Vəliyev.

**YANINCA** *zərf* 1. Öz yanı ilə, yanında, özü ilə bərabər. *Oğlunu yanınca aparmaq. – Həmin vəkillər yanlarıyca uzun-uzadı ərizələr, siyahılar gətirmişdilər.* C.Məmmədquluzadə.

2. Biri ilə bərabər, yanaşı, bir yerdə, yanı ilə, yan-yana. *Yanınca getmək. Yanınca qaçmaq. – Mən aşiqəm narınca; Gül əkdim kənarınca; Sonam sallandı, gəldi; Laçın da bir yanınca.* (Bayatı). *At çox dincdir. Adamyıxan deyil,* [Nurəddin] *yavaş-yavaş faytonun yanınca sürər.* S.S.Axundov.

3. ...boyu, ...boyunca. *Sahil yanınca. Divar yanınca.*

**YANI-YANI** b a x **yan-yanı**. *Həcər qocanın görməməsi üçün yanı-yanı çəkilib alma ağacına sıxılmaq istədi.* S.Rəhimov.

**YANIQ-YANIQ** *zərf* Yanıqlı-yanıqlı. *Aşıq Qərib yanıq-yanıq söyləsin; Enib eşqin dəryasını boylasın*. "Aşıq Qərib".

**YANQILICI** *zərf köhn.* Yanakı (papağın başa qoyulması tərzi). *Papağı yanqılıcı qoymaq. – Yoxsa ki papaq yanqılıcı; Əldə də bir quş, həm məst və bihuş.* M.Ə.Sabir.

**YANLAMA** "Yanlamaq"dan *f.is.*

**YANLAMAQ** *f.* Yan almaq, yanaşmaq, yaxınına, yanına gəlmək, yaxınlaşmaq. *Anam mətbəxdə qurdalanırdı. Yanlayıb qulağına əyildim.* Mir Cəlal. *..Müəllim tez Meracı yanlayaraq qabağa göndərdi*. Ə.Vəliyev.

**YANLI** *sif.* Yanı, tərəfi olan.

**YANLIQ** *is.* Bir şeyin yan hissəsində olan şey; yan hissəsi; bir şeyin yanını təşkil edən, yanına qoyulan, əlavə edilən şey. *Alaçığın yanlığı. Çiçəyin yanlığı*.

**YANLIQLI** *sif.* Yanlığı olan. *Yanlıqlı araba.*

**YANLIQSIZ** *sif.* Yanlığı olmayan.

**YANLIŞ** 1. *sif.* Düzgün olmayan, doğru olmayan; səhv. *Yanlış məlumat. Yanlış söz. Yanlış fikir. – Bilirdim ki, ilk təəssürat nə qədər güclü olsa da, çox vaxt insanı birtərəfli, yanlış nəticələrə aparıb çıxardır*. M.Hüseyn. *Təcrübədə Azərbaycan xalq musiqisinin yanlış surətdə notaya yazılmış nümunələrinə təsadüf olunur.* Ü.Hacıbəyov.

2. *is.* Səhv, qələt, xata. *Yanlışlarını düzəltmək. Yanlışını tutmaq. Yanlış etdim. Bu yazının yanlışı çoxdur. – Yanlış da bir naxışdır.* (Ata. sözü). *Maliyyə işinin zəifliyini nəzərə alaraq, nəzmiyyənin bir hissəsini Təbrizdə buraxmaq fikrinizə gəldikdə, bu, tamamilə yanlışdır.* M.S.Ordubadi.

**YANLIŞLI** *sif.* Yanlış (səhv, qələt) olan.

**YANLIŞLIQ** *is.* Səhv etmə, xata və səhv etmə, yanlış söz və ya hərəkət; səhv, qələt. *Onun sözündə bir yanlışlıq var. – Şükür əvvəllərdə Güləlinin əsgərliyə alınmasını bir yanlışlıq zənn etmişdi*. S.Hüseyn.

**YANLIŞSIZ** *sif.* Səhvsiz, qələtsiz; düzgün. *Yanlışsız yazı. Yanlışsız* (z.) *yazmaq.*

**YANLIŞSIZLIQ** *is.* Səhvsizlik, qələtsizlik.

**YANMA** "Yanmaq"dan *f.is.*

**YANMAQ** *f.* 1. Odlanmaq, alovlanmaq, od tutmaq, tutaşmaq. *Odun yaxşı yanır. – Düşmən tərəfindən od vurulan kənd yanırdı.* Ə.Vəliyev. // Odun, istinin təsiri ilə məhv olmaq, külə dönmək. *Kağız tonqala düşüb yandı. Buxarıdakı odunların hamısı yandı. Taya yandı.*

2. Həddən artıq od üstə qalmaqdan, yaxud çox qızmaqdan yanmış kimi olmaq, xarab olmaq, qupquru qurumaq, yanıq dadı vermək. *Xörək yandı. Ət yandı. Çörəklər təndirdə yandı.*

3. İşıq vermək, işıqlanmağa başlamaq. *Lampalar yandı. Şam yandı. Evdə elektrik yanır. – Qaş qaraldı; Tiflisin bütün lampaları yandı.* "Aşıq Qərib". [Molla Xəlilin] *kənd klubu nəzərini cəlb etdi. Qabağında qüvvətli bir qaz fanarı yanırdı.* S.Hüseyn. *Nəhayət, tamamilə qaranlıq düşdü, şəhərdə tək-tük qaz fanarları yanmağa başladı.* S.Rəhman.

4. İşıldamaq, par-par parıldamaq, bərq vurmaq. *Qılınclar günəş şüaları altında yanırdı. Barmağında üzüyün qaşı yanır. Otların üzərindəki şeh almaz kimi yanırdı.*

5. Bərk qızdırması, hərarəti olmaq. *Gecə səhərə qədər bədənim yanıb. Əlimi alnına qoydum, gördüm yanır. – Kişini üç gündü qızdırma tutub, elədi, elədi, təndir kimi yanır.* "M.N.lətif." // Qan axıb gəlməsindən hərarətlənib qızarmaq. *Qulaqlarım yanır. Üzü yanır. Yanaqları yanır. – Rus qızı minnətdarlığını bildirən bir hərəkətlə od kimi yanan əli ilə Ulduzun əlini sıxdı*. Ə.Məmmədxanlı. *Kürə qabağında işləyəndə Məşədi Hüseynin sifəti qıpqırmızı yanar, üzünün nuru daha da artardı.* Mir Cəlal.

6. Görünmək, nümayan olmaq, qızararaq parlamaq. *Göydə ulduzlar yandı. Üfüqdə qırmızı şəfəq yandı.* // Nura qərq olmaq, işıqlanmaq.

7. Günəş şüalarının təsirindən rəngi qaralmaq. *Bədəninin dərisi gündən yanıb.* // Günəşin təsirindən rəngi bozarmaq, rəngi qaçmaq.

8. Yağışsızlıqdan, quraqlıqdan məhv olmaq, qurumaq. *..Keçən il nəhayətdə quraqlıq olmaq səbəbi ilə və Qəzvinin ətrafında suyun qıtlığı cəhətilə əksəri-məhsulat yanıb əmələ gəlməmişdi*. M.F.Axundzadə. [Birinci kəndli:] *Doğrusu, əkin-əkənəcəyimiz yanırdı, camaatdan üç-dörd vəkil seçib göndərdik mirabın*

*yanına.* Ə.Haqverdiyev. *Yağış yağmadığından bütün mahalın əkinləri yanmışdı*. S.Hüseyn.

9. Bərk susuzluq hiss etmək, bərk su içmək istəmək, susuzluqdan əziyyət çəkmək. *Gəzdim hər yanını Milin, Muğanın; Yandıqca arxların suyundan içdim*. S.Vurğun. *İndi yay günü Mil düzündə yolçunun susuzluqdan yanmaq qorxusu yoxdur*. İ.Əfəndiyev.

10. *məc*. Birisinə qarşı qəzəbi, kini, acığı olmaq; acıq çəkmək (adətən tərkiblərdə). *Hind padşahı o qədər yanırdı Əhmədin əlindən ki, o saat Əhmədi saldı sandığın içinə, üstəlik bir tilsim də oxuyub döndərdi tüstüyə.* (Nağıl). *Üzümə dost kimi bəzən gülürsən; Dalda paxıllıqdan yanıb ölürsən.* S.Vurğun. *Xüsusilə Mayaya göstərdiyi üz, dediyi sözlər yadına düşəndə Qaraş əzabdan qovrulub yanırdı*. M.İbrahimov.

11. *məc*. Güclü bir hissi, ehtirası ifadə etmək. *Üz-gözü intiqam hissi ilə yanırdı. Gözləri şadlıqdan yanır*.

12. *dan*. Hədərə çıxmaq, boşa getmək, heçə çıxmaq; uduzmaq. *Üçlüyü yandı. Kartı yandı.* // Zərər və ziyan çəkmək, dərs almaq. *Mən bu işdə yandım.* // *məc*. Başqasının əziyyətini çəkmək, halına qalmaq, qeydinə qalmaq, başqası üçün heyifsilənmək, acımaq, təəssüf etmək (bəzən "halını", "əhvalını" sözləri ilə də işlənir). *Onun halına yanıram. – Qaraca qız ölümdən qurtarmasına çox şad olub, cəvərənin tələf olmasına o qədər də yanmadı*. S.S.Axundov. *Yandı əhvalına kənardan baxan; Doğdu ürəklərdə min şəfqətli hiss*. M.Rahim.

13. *məc*. Çox ələm və kədər çəkmək, hicran çəkmək.

14. Bəzi sözlərə qoşularaq frazeoloji ifadələr düzəldilir; məs.: əlindən yanmaq, oduna yanmaq, canı yanmaq.

**yana-yana** *zərf* 1) yanan vəziyyətdə, yanar halda ikən, yanaraq; 2) qovrula-qovrula, əzab və iztirab çəkə-çəkə, acıq çəkə-çəkə. [Rza bəy:] *..İndi gedib* [Şamdan bəyin] *puçunu elə yerdən buracağam ki, axıradək yana-yana qalsın.* N.Nərimanov; 3) ürək acısı çəkə-çəkə, həsrətlə, dərdli-dərdli, yanıqlı-yanıqlı. *Qarlı dağlar gəldi, düşdü araya; Qalmışam qürbətdə a yana-yana.* Aşıq Ələsgər. *Qoca nə yalvardı, nə də yaxardı; Yalnız yana-yana ardınca baxdı*. R.Rza. *Körpə isə yana-yana ağlayır, ananın ciyərini dağlayırdı.* Ə.Vəliyev.

**YANMALI** *sif.* Halına acımalı; halı şəfqət, mərhəmət doğuran, yazıq, zavallı (adətən "halına" sözü ilə). *Halına yanmalı adam.*

**YANMAZ** *sif.* Yanmayan, alışmayan, yanmaq xassəsi olmayan, od təsir etməyən, odadavamlı, odda, alovda tələf olmayan. *Yanmaz maddələr.*

**YANMIŞ** "Yanmaq"dan (1, 2, 3, 6, 7, 8 və 13-cü mənalarda) *f.sif. Yanmış körpünün qalığı. Yanmış ev. Yanmış çörək* (*xörək*). *Yanmış lampalar. Susuzluqdan yanmış çöllər.* – [Salamın] *yanmış, yorğun və tük basmış üzünü sərin bir külək oxşadı.* Mir Cəlal.

**YANPÖRTÜ** *zərf* Yanı üstündə, yanakı, yan tərəfə əyilərək; çəpəki, çəpinə. *Heybət yəhərin üstündə yanpörtü oturaraq Şamoya tərəf boynunu uzatdı.* S.Rəhimov. *Maşın axına qarşı yanpörtü durduğundan, sel onun bir tərəfini tez-tez qaldırıb-salırdı.* İ.Əfəndiyev.

**YANSIZ** *sif.* Yanı olmayan.

**YANSİNİRLİLƏR** *is. zool.* Molyusklar tipinin ən primitiv qrupunu təşkil edən ilbizlər.

**YANŞAQ** *sif. dan.* 1. Çoxdanışan, zəvzək, uzunçu. *Çox yanşaq adamdır.* □ **Yanşaqlıq etmək (eləmək)** – həddən artıq çox danışmaq, zəvzəklik etmək, uzunçuluq etmək. // Çox hürən; hürəyən. [Pəri Cadu:] *hələ burada oturub bir üç gün də yanşaq it kimi hürəcək.* Ə.Haqverdiyev.

2. *köhn.* Aşıq, ozan. [Cəfər paşa dedi:] *Əyə, yanşaq, yaxşı gəlibsən. Bu gün bizim bayramımızdır. Gəl, bir az sən də çal, oxu!* "Koroğlu". [Əsli:] *Bil ki, bura yanşaqlarının geyimi başqa cür olur.* "Əsli və Kərəm".

**YANŞAQLIQ** *is. dan.* Çox danışmaq xasiyyəti; naqqallıq, zəvzəklik, uzunçuluq. *Naşad sərxoşlara məxsus bir yanşaqlıqla* (z.) *danışıb gedəcəkdi*. S.Hüseyn. □ **Yanşaqlıq eləmək (etmək)** – çox danışmaq, naqqallıq etmək, zəvzəmək, uzunçuluq eləmək. *Ağa bəy: – A kişi, yanşaqlıq eləmə!* Ə.Əbülhəsən.

**YANŞAMA** "Yanşamaq"dan *f.is.*

**YANŞAMAQ** *f. dan.* Həddindən artıq çox danışmaq, zəvzəklik etmək, uzunçuluq etmək. *Ağa bəy Zeynalın qoluna girdi: – Yaxşı, yanşadın bəsdi, gedək Büləndgilin yanına.* Ə.Əbülhəsən.

**YANŞATMAQ** *icb.* Yanşatmağa, danışmağa məcbur etmək; söylətmək, danışdırmaq. [Fatma xala:] *Yenə soruşdun: kimi? Məni yanşatmaqdan, deyəsən, balam, xoşun gəlir.* Ə.Əbülhəsən.

**YANTAY** *is. dan.* Yağışdan, gündən qorunmaq üçün dirəklər üzərində düzəldilən dam; talvar. *Yağışdan yantayın altına sığınmış kolxozçular Poladı görən kimi səslərini bir az da bərkdən çıxarmağa başladılar.* S.Rəhman.

**YANTÖVRÜ** *zərf* Yanakı, yan-yanı. *Baş aqronom yantövrü qapıya baxdı...* Mir Cəlal.

**YANÜZƏNLƏR** *is. zool.* Xərçəngkimilərin şirin sularda yaşayan ən ali və böyük dəstəsi.

**YANVÁR** [*lat.* Januarius] Təqvim ilinin birinci ayı. *Şiddətli yanvar şaxtası kəsibtökürdü.* Mir Cəlal.

**YANYAXA** *sif.* Yaxası yan tərəfdə olan. *Yanyaxa köynək.*

**YAN-YAN: yan-yan baxmaq** – nifrətlə yuxarıdan-aşağıya, əyri-əyri baxmaq; saymazyana, ikrahla baxmaq. *Qoçular, quldurlar qatar taxardı; Fağır-füqəraya yan-yan baxardı.* Aşıq Ələsgər.

**YAN-YANA** *zərf* Yanaşı olaraq, bir-birinin yanında, bir-birinin yanınca. *Yan-yana oturmaq. Yan-yana durmaq. Yan-yana qoymaq.* – *Düzülmüş yan-yana daşlı təpələr; Qurulmuş keçilməz təbii səngər..* H.K.Sanılı. *Cəfər:* – *İki dənə yan-yana nömrə verin,* – *dedi.* Çəmənzəminli.

**YAN-YANAŞA** b a x **yan-yana**. [Cəmilə və Mirzağa] *ahəstə addımlarla yan-yanaşa olaraq mədənlərin arası ilə uzanıb gedən şose ilə gedirdilər.* S.Hüseyn.

**YAN-YANCAQ** b a x **yancaq**.

**YAN-YANI** *zərf* Yan tərəfi ilə, yanı üstə, yaxud bir yanını irəli verərək. *Göyərçin bir yanı üstə çevrildi, yan-yanı bir qədər uçub çayın ortasına düşdü.* M.Rzaquluzadə.

**YAN-YÖRƏ** *is.* Ətraf, ətraf sahə, həndəvər, yaxınlıq, yan. *Yan-yörəyə baxmaq* (*göz gəzdirmək*). – *Yan-yörəmdən gəlib-gedən çox idi; Mənə amma kömək edən yox idi.* A.Səhhət. *İkram Qaratelin gözünə sataşmamaq üçün gözlərini yan-yörəsinə dolandırırdı.* Ə.Əbülhəsən. // Ətrafında olanlar. [Mollabacı Hürzada:] *Paxıllıqdan qudurmuş itə dönüb yanyörəni dalayırsan.* Çəmənzəminli.

**YAPAĞ(I)** *məh.* 1. *is.* Yazda qırxılan qoyun yunu.

2. *sif.* Yapıxmış. *Qışda bu atların tükləri bir qarışdan da artıq saçaqlanar, sonra da yanağı bir yapıncı kimi üstlərinə yapışardı.* S.Rəhimov.

**YAPALAQ** *is.* 1. Bayquşlar dəstəsindən yırtıcı gecəquşu. *Laçın seydgahə qılanda güzar; İlim-ilim itər bayquş, yapalaq*. Q.Zakir. *Fəqət az-az yapalaq, qarğalar edir qır-qır; Qonubdu çöldəki cəmdəklər üstünə dağıdır*. A.Səhhət.

2. *məc.* Qorxaqlıq, acizlik simvolu kimi işlənir. *İddiası tərlan, özü yapalaq*. (Ata. sözü). [Aslan bəy:] *Adın Laçın bəy, özün yapalaqdan aciz*. N.Vəzirov. *Gündüzlər hünərli görünən qazaq; Qaranlıq düşəndə olur yapalaq..* H.K.Sanılı.

**YAPAYALNIZ** b a x **yapyalnız**. [Qız] *atasından acıq edib evlərindən çıxmış, kiçik bir otaqda yapayalnız yaşayır.* A.Şaiq.

**YAPDIRILMA** "Yapdırılmaq"dan *f.is.*

**YAPDIRILMAQ** *məch.* 1. Bişmək üçün təndirin divarına yapışdırılmaq. *Çörək yapdırılmaq.*

2. Etdirilmək, düzəltdirilmək. // Qayıtdırılmaq, düzəltdirilmək.

**YAPDIRMA** "Yapdırmaq"dan *f.is.*

**YAPDIRMAQ** *icb*. 1. Bişmək üçün təndirin divarlarına yapışdırtmaq. *Çörək yapdırmaq.*

2. Etdirmək, etməyə məcbur etmək. *Xədicə hər istədiyini yapdırmağa adət etmiş, ərköyün böyümüş bir qızdı.* S.Hüseyn. // Qayıtdırmaq, düzəltdirmək. [Qoca:] [Dara] *İstəxrdə əmsalı dünyada görünməmiş bir saray yapdırmaq fikrinə düşmüşdür*. Çəmənzəminli.

**YAPI** *is. kit.* Bina, tikinti. // *məc.* Təməl, bünövrə mənasında. *Gözəl ölkəm! Sən gözəlsən, gözəlsən öz əməlində; Zəncirlərdən azad olan bir dünyanın yapısısan.* S.Vurğun.

**YAPIXMA** "Yapıxmaq"dan *f.is.*

**YAPIXMAQ** *f.* Elastikliyini, yumşaqlığını, diriliyini itirərək yapışan kimi olmaq, basılıbsıxılmış kimi olmaq; yatmaq. *Keçə kimi yapıxmaq. Döşəyin yunu yapıxıb.*

**YAPIXMIŞ** *f.sif.* Yapışan kimi olmuş, yatmış, bir-birinə yapışmış; yatıq. *Əzilib yapıxmış küləş* [Tapdığın] *ayaqları altında xışıldayırdı*. Ə.Əbülhəsən.

**YAPIQ** *sif.* İşlənməkdən yaprıxmış.

**YAPIQMAQ** b a x **yapıxmaq**.

**YAPILMA** 1. "Yapılmaq"dan *f.is.*

2. *sif.* Qayrılma, qayrılmış, tikilmiş, düzəldilmiş. [Ərən:] *Kənarda palçıqdan yapılma bir büt var idi.* Çəmənzəminli. [Cəmilə:] [Mirzağanı] *tənəkdən yapılma xüsusi bir tüfürük və papiros kötüyü qabının yanına apardı.* S.Hüseyn.

**YAPILMAQ** *məch.* 1. Bişmək üçün təndirin divarına yapışdırılmaq. *Təndirə çörək yapılmaq. – Bu dəfə on pud unun çörəyi gərək yapılaydı.* C.Məmmədquluzadə.

2. Qayrılmaq, düzəldilmək, tikilmək.

**YAPILMIŞ** *f.sif.* 1. Bişmək üçün təndirin divarına yapışdırılmış (çörək).

2. Qayrılmış, düzəldilmiş, tikilmiş, qurulmuş. *Böyük poçt yolunun kənarında uca bir təllin üstündə vaqe, .. ağ daşdan yapılmış bina çaparların mənzili idi.* Ə.Haqverdiyev. *Bir qədər keçmiş sarı kağızdan yapılmış bir fənərin işığı ilə birisinin mənə tərəf gəldiyini gördüm.* S.Hüseyn.

**YAPINCI** *is.* Basılmış keçi yunundan (keçədən) hazırlanan plaşa oxşar qolsuz, uzun, enli geyim. [Qurbanəli:] *Bir-iki motal tutmuşdum, onu da satıb özümə yapıncı almışam.* N.Vəzirov. [Həmzə] *bərk-bərk yapıncısına bürünmüşdü.* Ə.Əbülhəsən. *Atlıların başlarında şələ papaq vardı, çiyinlərinə yapıncı salmışdılar.* S.Rəhman.

**YAPINCILI** *sif.* Əynində yapıncı olan. *Faytondan iki nəfər yapıncılı adam düşdü.* M.Hüseyn. *Deyəsən, gələn yapıncılı idi.* Mir Cəlal.

**YAPINCILIQ** *sif.* Yapıncı üçün yarayan. *Yapıncılıq keçə.*

**YAPIRTMA** "Yapırtmaq"dan *f.is.*

**YAPIRTMAQ** *f.* Qulaqlarını boynuna yapışdırmaq. *At qulaqlarını yapırdıb üstümə yüyürdü.*

**YAPIŞAN** *sif.* 1. Bir şeyə toxunduqda ondan qopmayan, ayrılmayan, yapışqan xassəsinə malik olan.

2. *məc.* Ürəyəyatan, xoşagələn. *Yapışan söz deyil.*

**YAPIŞDIRICI** *sif.* Yapışdırma xassəsi olan, bir-birinə yapışdıran. *Yapışdırıcı maddələr.*

**YAPIŞDIRILMA** "Yapışdırılmaq"dan *f.is.*

**YAPIŞDIRILMAQ** *məch.* Yapışqan (və s.) ilə bitişdirilmək. *Divarlara elanlar yapışdırılmışdır.*

**YAPIŞDIRILMIŞ** *f.sif.* Yapışqan (və s.) ilə bitişdirilmiş. *Yapışdırılmış kağız.*

**YAPIŞDIRMA** "Yapışdırmaq"dan *f.is.*

**YAPIŞDIRMAQ** *f.* 1. Yapışqanla və ya başqa yapışdırıcı maddə ilə bir şeyi başqa bir şeylə bitişdirmək. *Məktuba marka yapışdırmaq. Divarlara elan yapışdırmaq. Cırılmış səhifələri yapışdırmaq. Taxtaları yapışqanla bir-birinə yapışdırmaq.* // Qaynaq vermək, qaynaq vasitəsilə bir-birinə bitişdirmək, qaynaq etmək. *Boruları bir-birinə yapışdırmaq. Çaydanın lüləyini yerinə yapışdırmaq.* // Calamaq. *Sözü sözə yapışdırmaq.*

2. Sıx yaxınlaşdırmaq, təmas etdirmək. *Xavər qolunu uşağının boynuna sarıyaraq qucaqlamış və üzünü üzünə yapışdıraraq fikrə getmişdi.* M.İbrahimov.

3. *məc. dan.* Vurmaq, ilişdirmək, çəkmək. *Çoban canavarın belinə bir çomaq yapışdırdı.*

**YAPIŞDIRTMA** "Yapışdırtmaq"dan *f.is.*

**YAPIŞDIRTMAQ** *icb.* Başqası vasitəsilə yapışdırmaq; calatmaq.

**YAPIŞICI** *sif.* Yapışmaq xassəsi olan; yapışqan. *Yapışıcı maddə.*

**YAPIŞIQ** *sif.* 1. Bir-birinə yapışmış, bitişmiş. *Ətə yapışıq dəri. Bir-birinə yapışıq kağız.*

2. Sıx yaxınlaşdırılmış, lap yapışdırılmış; yanaşı, qonşu. *Məktəbə yapışıq klub binası. Bir-birinə yapışıq divarlar. Qaraj evə yapışıq* (z.) *tikilmişdir.*

3. *məc.* Özünə qarşı xoş meyil oyatma xüsusiyyəti, qanışirinlik, xoşa gəlmə, ürəyə yatma. *Yapışığı yoxdur.*

**YAPIŞIQLI** *sif.* 1. Yanaşı, lap yaxın, bir-birinə təmas edəcək dərəcədə yaxın; qonşu. *Əmrahgilin evi Səlminazgilin evinə yapışıqlı idi.* (Nağıl).

2. Yapışığı olan, xoşagələn, ürəyəyatan, yatımlı, qanışirin, suyuşirin, cazibəli. *Gülər ortaboylu, incə və zərif, yapışıqlı bir qız idi.* C.Cabbarlı. [Musa] *vücudca sağlam, boyca uca və sifətcə yapışıqlı idi.* Ə.Vəliyev.

**YAPIŞIQSIZ** *sif.* Yapışığı olmayan, xoşa gəlməyən. *Yapışıqsız adam.*

**YAPIŞIQSIZLIQ** *is.* Yapışığı olmama, xoşa gəlməmə; yapışmama.

**YAPIŞQAN** 1. *is.* Yapışdırmaq, bitişdirmək xassəsi olan maddə. *Yapışqan sürtmək. Xarrat yapışqanı. Sintetik yapışqan. – Vəzirzadə paketləri götürüb: – Yapışqanı möhkəm olsun, barı açılmasın, – dedi.* S.Rəhimov. *Hidayət ehmallıca qəzeti divardan asdı, əlinin yapışqanını sildi.* Mir Cəlal.

2. *sif.* Dəydiyi yerə yapışıb zorla ayrılan, yapışmaq xassəsi olan. *Yapışqan palçıq.*

**YAPIŞQANLAMA** "Yapışqanlamaq"dan *f.is.*

**YAPIŞQANLAMAQ** *f.* Yapışqanla yapışdırmaq, bitişdirmək, yapışqan sürtmək. [Dadaş] *sonra ağ kağızlardan götürüb yaşıl qovluğu yapışqanladı, hər tərəfdən onu sarıyıb, iri hərflərlə ünvanını yazdı...* S.Rəhimov.

**YAPIŞQANLANMA** "Yapışqanlanmaq"dan *f.is.*

**YAPIŞQANLANMAQ** *məch.* Yapışqanla yapışdırılmaq (bitişdirilmək), yapışqan sürtülmək.

**YAPIŞQANLAŞMA** "Yapışqanlaşmaq"dan *f.is.*

**YAPIŞQANLAŞMAQ** *f.* Yapışqan kimi olmaq, yapışqana dönmək, yapışqan xassəsi almaq. *İsti su götürdükdə nişasta yapışqanlaşaraq həlməşik təbəqə əmələ gətirir.* R.Əliyev.

**YAPIŞQANLAŞMIŞ** *f.sif.* Yapışqan kimi olmuş, yapışqana çevrilmiş. *Yapışqanlaşmış maddə.*

**YAPIŞQANLATMA** "Yapışqanlatmaq"dan *f.is.*

**YAPIŞQANLATMAQ** *icb.* Yapışqanla yapışdırtmaq, yapışqan vurdurmaq, birinə yapışqanlama işi gördürmək.

**YAPIŞQANLI** *sif.* Yapışqan sürtülmüş. // Tərkibində yapışqan olan.

**YAPIŞQANLIQ** *f.* Yapışmaq xassəsi.

**YAPIŞQANOTU** *is. bot.* Çay, arx və meşə kənarlarında bitən çoxillik ot bitkisi.

**YAPIŞMA** "Yapışmaq"dan *f.is.*

**YAPIŞMAQ** *f.* 1. Toxunduğu şeyə ilişib ayrılmamaq, yaxud zorla qopacaq bir surətdə bitişmək; sıvaşmaq. *Kitabın səhifələri bir-birinə yapışmışdır. Ayaqqabılarıma qəliz palçıq yapışıb. –* ..[Qurban] *ayaqlarına buz kimi yapışan yırtıq çustunun çamırını təmizləyə-təmizləyə: – Molla, mənə bir məktub yaz! – dedi.* A.Şaiq.

2. Bir-birinə təmas edəcək dərəcədə yaxın olmaq, tamamilə yanaşmaq; çatmaq. *Usta Ağabalanın saqqalı gicgahlarına getdikcə ucları nazilib gözəl surətdə qulaqlarına yapışmışdır.* Çəmənzəminli. // Bir-birindən qopmamaq, ayrılmamaq. *Susuzluqdan dodaqları bir-birinə yapışmışdı.*

3. Tutmaq, bərk-bərk tutmaq, qarmalamaq. *Əlindən yapışmaq. Qolundan yapışmaq. – ..Birə beş bir-birinə söyəndən sonra bellərə yapışdılar.* N.Nərimanov. *Kərbəlayı Heydər əmi qeyzli çıxardı küçəyə və gəlib yapışardı qulaqlarımdan, qalxızardı göyə.* C.Məmmədquluzadə. *Mühəndis isə, yəhər əyilməsin deyə, üzəngidən yapışmışdı.* M.İbrahimov. // Tutub qaldırmaq; qaldırmaq (çəkmək, dartmaq) üçün əli ilə tutmaq. [Qurban:] *Di gəl, bu şələyə yapış, qoy dalıma.* Ə.Haqverdiyev. *İnəkləri sağıb üçqulplu qazanı doldurduq, hərəmiz bir qulpundan yapışıb qazanları ocağın qırağına gətirdik.* A.Divanbəyoğlu. // Dişlərini keçirmək, dişləri ilə tutub buraxmamaq. *İt baldırımdan yapışdı.*

4. Məşğul olmaq, başlamaq, girişmək, şüru etmək. *Bir sənətdən yapışmaq. Bir işdən yapışmaq.* – [Kərbəlayı Zalın] *arvadı hərdənbir deyirdi: – A kişi sənin saqqalına nə şaşka yaraşır, nə də şapka. Gəl bu qorodovoyluqdan əl çək! Bir balaca alış-verişə yapış.* Ə.Haqverdiyev. [Məşədi Əsgərin] *bu vasitə ilə hərçənd qolu sağalmağa başlamışdısa da, amma işə yapışmağa qüdrəti yox idi.* S.M.Qənizadə.

5. *məc.* Dəymək, toxunmaq. *Çovutma bir güllə gözlənilmədən; Yapışır alnıma, yıxılıram mən.* S.Vurğun.

6. *məc. dan.* Yapışıb əl çəkməmək, bir an belə aralanmamaq; əl çəkməyərək danışmaq, müraciət etmək, təngə gətirmək. *Adama yapışdımı, əl çəkən deyil.*

7. Keçmək, sirayət etmək. *Soyuğa öyrənmiş adama azar çətin yapışar.*

8. *məc. dan.* Bənd olmaq, mane olmaq, ...qoymamaq. *Acıq edib gedənə yapışma.*

**YAPMA** 1. "Yapmaq"dan *f.is.*

2. *is. arxit.* Plastik və s. materiallardan düzəldilən bəzək. *Yapma işləri. // sif.* Bu cür düzəldilən. *Yapma bəzək. Yapma naxışlar.*

3. *is.* Divara yapılan təzək. *Bir tövlə qayıtdırsan əgər, bir də samanlıq; Mən də sağaram, həm peyinin yapma qayırram.* M.Möcüz.

4. *sif.* Süni, saxta, yalançı, uydurma, qondarma, yalan. *Yapma gözəllik. Yapma məhəbbət.* – [Oqtay:] *Xatırlayırmısan, bir zaman yapma həyatın nə olduğunu .. sənə öyrədirdim.* C.Cabbarlı. *Gözəlliklər yapma, duyğular cansız; Mənə tən eyləyir hər yetən qansız.* Ə.Cavad.

**YAPMAQ** *f.* 1. Bişmək üçün təndirin divarına yapışdırmaq. *Qasım əminin övrəti Həlimə xala çörək yapırdı.* C.Məmmədquluzadə. *Biz almışıq arvadı əppək yapa.* Ə.Nəzmi. // Ümumiyyətlə, yapışdırmaq. *Neyləyirdim bəzəyi, ya düzəyi? Dama, divara yapardım təzəyi.* M.Ə.Sabir.

2. *köhn.* Etmək. *Nə yapırsan, ay biçarə; Nə ölkəyə səs salırsan.* Molla Cümə. [İsmət:] *Get, nə yaparsan yap, çəkil get, durma!* H.Cavid. *Zeynal şaşırdı, nə yapacağını təyindən aciz kimi idi.* S.Hüseyn. *Bir axşamçağı idi. Başmaqseyri yapmaq fikri ilə evdən çıxdım.* T.Ş.Simurq.

3. *köhn.* Tikmək, qayırmaq, düzəltmək, qurmaq. *Xatirin cəm eylədin, əhli-vəfa könlün pozub; Bir imarət yapmağa min ev yıxar memar tək.* Füzuli. *..Tazədən bir möhkəm barı yapdılar.* "Dərbəndnamə". *İki kamança, iki tar tapdılar; Bir çəmənin üstə məclis yapdılar.* A.Səhhət.

**YAPMALIQ** *is.* Sünilik, saxtalıq; yapma şeyin halı.

**YAPÓN** *is.* Yaponiyanın əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Yapon xalqı. Yapon dili. Yapon musiqisi.*

**YAPONCA** *sif.* və *zərf* Yapon dilində. *Yaponca danışmaq. Yaponca lüğət.*

**YAPRIXMA** "Yaprıxmaq"dan *f.is.*

**YAPRIXMAQ** b a x **yapıxmaq**.

**YAPYALQIZ** b a x **yapyalnız**. *Məndən bir az aralı mənim kimi yapyalqız; Bir ağacın altında, skamyanın üstünə; Qəzet salıb oturmuş, bir gözəl sarışın qız.* S.Rüstəm.

**YAPYALNIZ** *zərf* Tamamilə yalnız, tək, tək-tənha. *Yapyalnız oturmaq. Yapyalnız qalmaq.* – *Belə bir anda durub yapyalnız; Ləkələnmiş bir adam lap yalnız.* S.Rüstəm.

**YAR** *is.* [*fars.*] 1. Dost, yoldaş. *Əkinçilər yarıyam; İgidlər sərdarıyam; Qızılın adı çıxmış; Mən ondan yuxarıyam.* Ə.Cavad. *Bir zamanlar nə sən, nə mən; Şad görmədik dostu, yarı.* S.Vurğun. ◻ **Yar olmaq** – yoldaş olmaq, dost olmaq, kömək olmaq. *Bizə yar olmasa saqi, biz ona yar olalım.* Qövsi. [Teymur ağa:] *Amma cənabi-əqdəsi-ilahi doğruya yar olub, sənin muradın əksi üz verdi.* M.F.Axundzadə. ◻ **...yar olsun!**.. – ...kömək olsun! (xeyir-dua ifadəsi). [İlyas:] *Göylər sənə yar olsun, oğlum! – dedi.* M.Hüseyn.

2. *klas.* Sevgili, məşuq, məşuqə. *Yardan ayırmaq. Vəfalı yar. Yarından ayrı düşmək.* – *Ağdamın yollarında; Bənd oldum kollarında; Bir cüt bəzbənd olaydım; Yarımın qollarında.* (Bayatı). [Şahbaz bəy:] *Tamam Parijin qızları qurban olsun sənin bir tükünə, mənim ki sənin tək gözəl bir yarım var..* M.F.Axundzadə. [Gəray:] *Eşqimi nazlı yara anlatdım; Sözümə bal, noğul, şəkər qatdım.* A.Şaiq.

**YARA** *is.* 1. Bədən, yaxud onun daxili orqanları toxumalarının hər hansı bir silah və ya başqa iti, bərk şeylə zədələnməsi və bu zədənin yeri. *Güllə yarası. Xəncər yarası. Yarasını sarımaq. Yaradan qan axır.* – *Qılınc yarası sağalar, dil yarası sağalmaz.* (Ata. sözü). *Hənifə arvadla Gülgəz Səmədin dizinin tikanlarını çıxardıb yarasını sarımışlar.* İ.Hüseynov. ◻ **Yara almaq** – yaralanmaq. **Yara vurmaq** – 1) yaralamaq; 2) *məc.* qəlbini incitmək, qəlbə toxunan söz demək, tənə vurmaq. **Yarası tərsləşmək** – yarası şiddət etmək, sağalmamaq. // Hər nə şəkildə olursa olsun, bədənin bir yerində əmələ gəlmiş zədə; xora. *Əlləri yara içindədir. Yara yeri. Bədənini yara basmış.*

2. *məc.* Dərd, iztirab, ruhi sarsıntı, ürək acısı. *Ürək yarası.* – [Rəsul:] *Sənəm yarım mərhəm eylər yaraya; Şəhri-Tiflis dedikləri budumu?* "Aşıq Qərib". [Xədicə:] *Nə vaxt mənim ürəyimin yarası sağalacaqdır?* N.Nərimanov. *Qəlbinin vardı dərin bir yarası; Gecə-gündüz su deyib inlərdi.* M.Müşfiq.

3. *məc.* Cəmiyyətdə olan mənfi hadisələr haqqında. *Yazıçı öz əsərində köhnə cəmiyyətin yaralarını açıb göstərmişdir.* // *məc.* Vurulan ziyan, zərər, təxribat haqqında.

◊ **Yara bağlamaq** *məc.* – imdada çatmaq, kömək etmək, yardıma qoşmaq. *Əsil qəhrəmanlıq yara bağlamaqdadır, abad etməkdədir.* H.Cavid. **Yarasına toxunmaq** – birinin

gizli dərdi haqqında danışmaq, zəif yerinə toxunmaq. *Qoca bu cavabdan çobanın yarasına toxunmuş olduğunu bildi.* M.Rzaquluzadə. **Yarasını təzələmək** – birinin dərdini yadına salıb pərişan etmək, dərdini təzələmək.

**YARADAN** 1. "Yaratmaq"dan *f.is. Gələcəyi yaradanlar. – Tarixdə tarixi yaradan durur.* S.Vurğun.

2. "Yaratmaq"dan *f.sif. Yaradan əllər. Sabahı yaradan gənclərdir.*

3. *is. din.* Tanrı, Allah, xaliq; xəlq edən qüvvə. [Banı xanım:] *Sənə kömək istərəm mən xudadan; İşinə fərəc versin böyük Yaradan.* "Aşıq Qərib". *Yaradan yetişsin özü dadına; Viran qaldı gözəl bağı Nigarın.* Molla Cümə. *Yaradan yetirsin bizi murada; Mənim ayım, günüm uzundur, gəlin!* Aşıq Əmir.

**YARADICI** 1. *is.* Bir şey yaradan, həyata gətirən, meydana gətirən adam. *Axır, bir de görüm ki, bu təzə firqənin yaradıcısı kimdir?* C.Məmmədquluzadə. [Gülsabah:] *..Öz sənətini yaxşı bilməyən bir usta bir yaradıcı ola bilməz.* C.Cabbarlı.

2. *sif.* Bir şey yaratmağa qadir olan, maddi və mənəvi sərvətlər yaradan. *Yaradıcı fikir. Yaradıcı qüvvələr. Yaradıcı əllər. – .. Hər kəsin ixtirası yaradıcı əməyinin məhsuludur.* S.Rəhimov.

3. *is. din.* Yaradan, xaliq, Allah, Tanrı.

**YARADICILIQ** *is.* İnsanın maddi və mənəvi sərvətlər yaratmağa doğru yönəldilmiş fəaliyyəti. *Kütlələrin canlı yaradıcılıq fəaliyyəti. Yaradıcılıq prosesi. Söz yaradıcılığı. Elmi yaradıcılıq. Bədii yaradıcılıq.* // Yaradıcı əməyin məhsulu, yaradılmış maddi və mənəvi sərvətlərin məcmusu. *Uşaq yaradıcılığı sərgisi. Sabir yaradıcılığı. Xalq yaradıcılığı* (*folklor*). *– Yaradıcılığı heç bir zaman öz təravətini itirməyən.. sənətkar ən bəxtiyar insandır.* Ə.Vəliyev.

**YARADILAN** 1. "Yaradılmaq"dan *f.sif.*

2. *is. din.* Yaranmış, məxluq.

**YARADILIŞ** *is.* 1. Yaratmaq işi; yaradılma, törədilmə, vücuda gətirilmə. ["Vətən dili" əlifba kitabının] *yaradılışına bais olan səbəbini, məsələdən xaric olsa da, burada göstərməyə məcburam.* F.Ağazadə.

2. Varlıq, xilqət, təbiət. *Dəyişmək – yaradılışın, təbiətin qanunudur.* M.İbrahimov.

3. Bünyad, kök, bünövrə, əsas. *Yaradılışı zəifdir.*

**YARADILMA** "Yaradılmaq"dan *f.is.*

**YARADILMAQ** *məch.* Vücuda gətirilmək, törədilmək. *Stansiya yenicə yaradılmışdı.*

**YARADILMIŞ** *f.sif.* Vücuda gətirilmiş, törədilmiş.

**YARA-XORA** *is.* Çirkli, həm də çox yarası olan.

**YARA-XORALI** *sif.* Çirkli, həm də çox yarası olan.

**YARAQ** *is.* 1. Silah. *Koroğlu gördü, Dəmirçioğlu o qədər yaraq götürüb ki, altında tərpənə bilmir.* "Koroğlu". *O saat əlimizə keçən yaraqla və bombalarla .. yola düşdük.* Ə.Əbülhəsən.

2. Yaraşıq, bəzək şeyləri. *Düzəlib hər yarağı; Qalıb saqqal darağı.* (Ata. sözü).

**YARAQ-ƏSBAB** *top. köhn.* Cürbəcür silahlar. [Veys:] *Uşaqlar, o yaraq-əsbabı, tapançanı da qoyun bax bura, bəri küncə.* Ə.Əbülhəsən.

**YARAQ-ƏSLƏHƏ** *top. köhn.* Müxtəlif silahlar. *Hacı Qara özü qorxaq olduğu halda, götürdüyü yaraq-əsləhə ilə başqalarını qorxutmaq istəyir.* "Kirpi".

**YARAQ-ƏSLƏHƏLİ** *köhn.* bax **yaraqlı-yasaqlı**.

**YARAQLANDIRILMA** "Yaraqlandırılmaq"dan *f.is.*

**YARAQLANDIRILMAQ** *məch.* Silahlandırılmaq.

**YARAQLANDIRMA** "Yaraqlandırmaq"dan *f.is.*

**YARAQLANDIRMAQ** *f.* 1. Silahlandırmaq.

2. Müxtəlif alət və ləvazimatla təchiz etmək.

**YARAQLANMA** "Yaraqlanmaq"dan *f.is.*

**YARAQLANMAQ** *f.* Silahlanmaq. *Dəlilər işi belə görəndə yaraqlanıb atlandılar.* "Koroğlu". [Mustafa bəy:] *Xata görünür, uşaqlara deginən ki, hamısı yaraqlansınlar.* Ə.Haqverdiyev. *Yaraqlandın o gün sən də; Səsin düşdü dağdan-dağa.* S.Vurğun.

**YARAQLATMA** "Yaraqlatmaq"dan *f.is.*

**YARAQLATMAQ** *f.* Yaraqla, silahla təchiz etmək.

**YARAQLI** *sif. köh.* Silahlı. [Ömər] *çərkəzi paltarda, çəkmədə, əlində matraq, üstü ya-*

*raqlı içəri daxil olur və sevinir.* N.Nərimanov. *Telinin ucunu qaşına tökmüş, qarayağız, qırmızı yanaqlı, yaraqlı Qədirdən şübhələnmişdi.* Mir Cəlal.

**YARAQLI-YASAQLI** *sif.* və *zərf köhn.* Yaxşıca silahlanmış, cürbəcür silahlarla silahlanmış. *Bir də baxdı ki, budur, bir dəstə yaraqlı-yasaqlı atlı gəlir.* "Koroğlu". *Dəmirçi Əhməd oğlunu yaraqlı-yasaqlı görüb dedi..* (Nağıl). [Məclisi aparanın] *üstü-başı yaraqlı-yasaqlıydı.* "Aşıq Ələsgər".

**YARAQSIZ** *sif.* və *zərf* Silahsız. *Şərifzadə yaraqsız gəldiyindən, yolu kəsənlərin əmrinə tabe olub faytondan yerə düşdü..* M.Hüseyn.

**YARAQSIZLIQ** *is.* Silahsızlıq.

**YARAQ-YASAQ** *köhn.* bax **yaraq** 1-ci mənada. [Ağsaqqal kişi:] *Yaraq-yasağını yüklərdə gizlət.* Mir Cəlal.

**YARALAMA** "Yaralamaq"dan *f.is.*

**YARALAMAQ** *f.* 1. Silah və s. ilə yara vurmaq, yara açmaq; zədələmək. *Əlini yaralamaq. – Marala bax, marala; Vur, ox ilə yarala; Dərd verən dərman versin; Dərdim düşsün qarala.* (Bayatı). *Qeyrətdən keçəndə, su üstündə yay fəsli hər bir müsəlman qardaş yeddi-səkkiz adam yaralar.* C.Məmmədquluzadə. [Aslan bəy:] *Ancaq yazıq Əsəd bəyi yaralayıb qaçarkən bir qırmızı çuxa vardı əynində..* C.Cabbarlı.

2. *məc.* Mənəvi əzab və iztirab vermək, qəlbini sındırmaq, ruhən incitmək (çox vaxt "qəlbini", "ürəyini" sözləri ilə). [Məmmədbağır:] *Əsmərcan, sən mənim ürəyimi yaralayırsan!* S.Hüseyn.

**YARALANDIRMA** "Yaralandırmaq"dan *f.is.*

**YARALANDIRMAQ** *icb.* Başqasının əli ilə yaralamaq, yara vurdurmaq, yaralanmasına səbəb olmaq.

**YARALANMA** "Yaralanmaq"dan *f.is.*

**YARALANMAQ** *qayıd.* 1. Güllə, kəsərti və s. ilə bədəninin bir yerində yara açılmaq, bədəninin bir yeri zədələnmək, yara olmaq. *Ayağından yaralanmaq. Müharibədə yaralanmaq. Güllə ilə yaralanmaq. –* [Qasıməli:] *Tutublar, yəqin ki, yaralanıbdı, yoxsa bu da qaça bilərdi.* C.Məmmədquluzadə. *Mirsaqulu yaralanmış və yerə yıxılmışdı.* S.Hüseyn.

2. *məc.* Çox ağır mənəvi sarsıntıya məruz qalmaq; dərdlənmək. *Yaralıdır könlüm quşu, yaralı; Yaralandı yazıq şair olalı.* Ə.Cavad.

**YARALANMIŞ** *f.sif.* Yara almış, silah və s. ilə bir yerindən zədələnmiş; yaralı. *Yaralanmış əsgər.* // Məc. mənada. *Ey həmdəmim, səni qana qərq elər; Gəl tərpətmə yaralanmış könlümü.* M.V.Vidadi.

**YARALATMA** "Yaralatmaq"dan *f.is.*

**YARALATMAQ** *icb.* Yaralanmasına səbəb olmaq, yara vurdurmaq. *Atı yaraladarsan, gözlə.*

**YARALĞAN** *is. məh.* Yarğan. *Dağılıb havaya qanın iyisi; Gəlir yaralğandan yapalaq səsi.* H.K.Sanılı.

**YARAMAZCA(SINA)** *zərf* Yaramaz adama xas olan bir surətdə; alçaqcasına, nalayiq bir surətdə. *Yaramazcasına hərəkət etmək.*

**YARAM-YARAM** *is. zar.* Xanəndələrin, aşıqların oxuduqları zaman havanı uzatmaq üçün işlətdikləri söz. *Aşığın sözü qurtaranda yaram-yaram çağırar.* (Ata. sözü).

**YARANAL** *dan.* Keçmişdə "general" sözünün canlı dildə işlənən təhrif edilmiş forması. *İstəyirəm sana bir dastan yazam; Qoburnat eşidə, yaranal bilə.* Aşıq Ələsgər. *Bundan ötrü lazımdır .. yüz nəfər hacını yaranal eləmək.* C.Məmmədquluzadə. [Əhməd:] *Sən get, knyazlardan xəbər al, yaranallardan xəbər al.. Onda bilərsən ki, Aslan bəy kimdir.* N.Vəzirov.

**YARANAN** *f.sif.* Yaradılmış, vücuda gətirilmiş (gəlmiş). // *İs. mənasında.* Məxluq. [Xanburabi:] *Hər bir yaranan yaşamalıdır.* Çəmənzəminli.

**YARANIŞ** *is.* 1. Yaranma, vücuda gəlmə, yoxdan var olma.

2. Xilqət, təbiət, doğuluş. *Sən ki yaranışdan gözəlsən belə; Bir dastan olmusan ağıza, dilə.* S.Vurğun.

**YARANMA¹** "Yaranmaq¹"dan *f.is. Azərbaycan ordusunun yaranma günü.*

**YARANMA²** "Yaranmaq²"dan *f.is.*

**YARANMAQ¹** *f.* 1. Əmələ gəlmək, meydana gəlmək, doğulmaq, törəmək. *Mən əzilən bir sinfin hayqıran; Haq bağıran sədasından yarandım.* M.Müşfiq. *Bilirsən ki, mən gözələm, dastanlara düşmüş adım; Yarandığım*

*gündən bəri bağlanmamış qol-qanadım.* S.Vurğun. [Ovçu:] *Qızım, – dedi, – ürəyiniz yuxa olur, bilirəm, amma* [quşlar] *bizim üçün yaranmışdır.* Mir Cəlal.

2. Təsis edilmək, təşkil olunmaq; yaradılmaq. *Əlaqə yaranmaq. Aralarında dostluq münasibəti yaranmışdır. – Tikintidə kiçik bir özfəaliyyət dərnəyi yarandı.* İ.Əfəndiyev.

**YARANMAQ²** *f.* Birini xoşnud etmək üçün öz hərəkətlərini onun xeyrinə, tələbinə uyğunlaşdırmağa çalışmaq, yaltaqlanmaq. *Yaxın qohumlarını, gələcəkdə böyük sərvətə malik olası bacılara yarananlar və yaltaqlıq edənlər hər tərəfdən bacıların qollarından tutub, onları saxlamaq istəyirdilərsə də, fayda vermirdi.* Ə.Haqverdiyev. [Yasavul:] *Doğrudur, tüfəng bu dünya üzündə igidin birinci yaraşığıdır, – deyə Məstəli bəyə yaranmağa başladı.* S.Rəhimov.

**YARANMIŞ** *f.sif.* Xəlq olunmuş, məxluq, canlı; doğulmuş. *Məlum şeydir ki, cəmi yaranmışlar öləcəklər.* C.Məmmədquluzadə. *Qol-qanad açardım, sözün doğrusu; Hər bir yaranmışın arzusudur bu.* S.Vurğun.

**YARA-PARA** b a x **yara-xora**.

**YARAR** b a x **yararlı**. *Götürün oxların, ey didələrim, torpaqdan; Bu yarar nəsnələrin qədrini yaxşıca bilin.* Füzuli. [Vəzir:] *Padşah sağ olsun, keçəçilik sənəti çox yarar sənətdir*. Ü.Hacıbəyov.

**YARARLAŞDIRILMA** "Yararlaşdırılmaq"-dan *f.is.*

**YARARLAŞDIRILMAQ** *məch.* Yararlı hala salınmaq, uyğunlaşdırılmaq, əlverişli hala gətirilmək.

**YARARLAŞDIRMA** "Yararlaşdırmaq"dan *f.is*. *Bu işi Kür-Araz düzənliyində suvarılan torpaqları istifadə üçün yararlaşdırma idarəsinin işçiləri görməlidirlər.* (Qəzetlərdən).

**YARARLAŞDIRMAQ** *f.* Yararlı hala salmaq, uyğunlaşdırmaq, əlverişli hala gətirmək.

**YARARLAŞMA** "Yararlaşmaq"dan *f.is.*

**YARARLAŞMAQ** *f.* Yararlı hala gəlmək, uyğunlaşmaq, əlverişli hala gəlmək.

**YARARLI** *sif.* Yarayan, əlverişli, uyğun, lazımlı, işə gələn, faydalı. *Kostyuma yararlı parça. – O, özünə yararlı bir kaman seçmək üçün qarşısına bir çox kaman tökdürmüşdü.* M.S.Ordubadi. *Əsil bəla orasındadır ki, usta zeynallar özlərini dünyada ən ağıllı, işgüzar və yararlı adam hesab edirlər*. M.İbrahimov.

**YARARLIQ** *is.* İşə yarama, əlverişli olma, faydalı və lazımlı olma; fayda, yararlı xidmət. *Çar hökuməti İran inqilabında böyük yararlıq göstərən Culfa qrupuna çox ciddi nəzarət təşkil etmişdi.* M.S.Ordubadi.

**YARARLILIQ** *is.* Yararlı şeyin hal və keyfiyyəti.

**YARARSIZ** *sif.* Yararı olmayan, faydası olmayan, heç bir fayda verməyən; əlverişsiz, lazımsız, dəyərsiz, vecsiz. *Yararsız yer. Yararsız bina.*

**YARARSIZLIQ** *is.* Yararsız şeyin hal və keyfiyyəti; heç bir şeyə yaramama, fayda verməmə.

**YARASA** *is.* 1. *zool.* Gündüzlər yatıb gecələr ov edən, siçana oxşar geniş pərdəqanadlı heyvan. *O da bir cürə yarasadır. Gündüz yatır, gecə uçur.* Ə.Vəliyev.

2. *məc*. Cəhalətpərəstlik, maarif düşməni simvolu kimi işlənir.

**YARAŞDIRILMA** "Yaraşdırılmaq"dan *f.is.*

**YARAŞDIRILMAQ** *məch.* 1. Uyğunlaşdırılmaq, yaraşan bir şəklə salınmaq.

2. Yaraşıqlı edilmək, yaraşıq verilmək, zinətləndirilmək, bərbəzək verilmək.

3. İstinad edilmək (inanılmaz bir şeyə).

**YARAŞDIRMA** "Yaraşdırmaq"dan *f.is.*

**YARAŞDIRMAQ** *f.* 1. Uyğunlaşdırmaq, yaraşan bir şəklə salmaq.

2. Yaraşıqlı etmək, yaraşıq vermək, zinətləndirmək, bərbəzək vermək.

3. Yan-yana düzmək; tutuşdurmaq. *Sözü sözə yaraşdırmaq.*

4. Əsassız bir şeyi inanılacaq dərəcədə birisinə isnad etmək.

**YARAŞIQ** *is.* Bəzək, zinət. *Ehtiyat igidin yaraşığıdır.* (Ata. sözü). // Qəşənglik, gözəllik. *Yan durun, aşıq gəldi; Elə yaraşıq gəldi; Yel vurub sinən açdı; Gözümə işıq gəldi.* (Bayatı). *Arvadın yaraşığı saçdır.* Qantəmir. ☐ **Yaraşığa mindirmək** – yaraşıqlı etmək, bəzək vermək, zinət vermək. **Yaraşıq vermək** – bəzək vermək, zinət vermək. *Özünə yaraşıq vermək. – Rəhimənin qıyıq gözlərindən silinməyən təbəssüm qızartısı çəkilməyən,*

*yumru, ətli, tüksüz sifətinə yaraşıq verirdi.* İ.Hüseynov. **Yaraşıqdan düşmək** – yaraşığını itirmək, görkəmsiz olmaq, gözəlliyini itirmək. **Yaraşıqdan salmaq** – yaraşıqdan, bəzəkdən, gözəllikdən məhrum etmək, görkəmsiz etmək. // Yaraşma, uyğunluq, tutma. *Heç bir yaraşığı yoxdur.* **Yaraşıqdan yad olmaq** – yaraşığı, gözəlliyi itmək, yox olmaq.

**YARAŞIQLANMA** "Yaraşıqlanmaq"dan *f.is.*

**YARAŞIQLANMAQ** *f.* Yaraşıqlı olmaq, yaraşığa minmək, qəşəngləşmək, gözəlləşmək. *Qoca istəyirdi ki, onun zəhmətinin məhsulu da bu süfrədə görkəmli bir yer tutsun, .. belə ağ bir alov işığında yaraşıqlanıb bəzənsin...* S.Rəhimov.

**YARAŞIQLI** *sif.* Yaraşığı olan, görünüşcə qəşəng, gözəl. *Yaraşıqlı paltar. Yaraşıqlı qız.* – [Ağa Mərdanın arvadı:] *Məni Hacı Qafurun arvadı yaraşıqlı* (z.) *görsə, əlbəttə, artıcaq sayar.* M.F.Axundzadə. *Ay quşcuğazlar nə yaraşıqlısız; Can kimi bəslənməyə layiqsiz.* A.Səhhət. [Humay] *çox arıq olmasına baxmayaraq, yaraşıqlı bir oğlan idi.* İ.Əfəndiyev.

**YARAŞIQLILIQ** *is.* Yaraşıqlı şeyin hal və keyfiyyəti; gözəllik, qəşənglik.

**YARAŞIQSIZ** *sif.* 1. Yaraşığı olmayan, gözəlliyi, qəşəngliyi olmayan; görkəmsiz. *Yaraşıqsız adam. Yaraşıqsız ev.*

2. Uyğun olmayan, münasib olmayan, layiq olmayan, yöndəmsiz. *Yaraşıqsız söz.*

**YARAŞIQSIZLIQ** *is.* 1. Yaraşığı olmayan şeyin hal və keyfiyyəti, yaraşıqdan məhrumluq, görkəmsizlik, gözə xoş gəlməmə. *Geyimin yaraşıqsızlığı. Otağın yaraşıqsızlığı.*

2. Qeyri-münasiblik, uyğunsuzluq, yaraşmamazlıq, yöndəmsizlik.

**YARAŞMA** "Yaraşmaq"dan *f.is.*

**YARAŞMAQ** *f.* 1. Uyğun gəlmək, yaxşı tutmaq, yaxşı göstərmək. *Bu paltar sənə yaraşmır. – Sənə al don yaraşır, niyə qarə geymisən sən?* S.Ə.Şirvani. [Mehribanın] *yeni paltarı vücuduna çox yaxşı yaraşırdı.* S.Hüseyn. *Qaratelin üz-gözündən rişxənd yağırdı və bu ifadə qızın munis, dolğun çöhrəsinə qətiyyən yaraşmırdı.* Ə.Əbülhəsən. ☐ **...nə yaraşır** – intonasiyadan asılı olaraq gah müsbət, gah mənfi mənada işlənir. *Bu yaşda ona belə paltar nə yaraşır. – Qabaqda qalırmı arpan səhərə? Üzəngilər nə yaraşır yəhərə.* "Koroğlu".

2. Layiq olmaq, münasib olmaq. *Belə hərəkətlər insana yaraşmaz. – Yetişibsən, indən belə yaraşmaz; Yadlar ilə deyib-danışmaq sənə.* Q.Zakir. [Vəzir:] *Mən cavab verdim ki, əgər mənə yaraşsaydı, bu əlli yaşımda Teymur ağa ilə güləşib onun arxasın yerə qoyardım.* M.F.Axundzadə. [Fəridə:] *Bu ki rüsvayçılıqdır, .. heç doktora yaraşarmı?* Ə.Məmmədxanlı. // Uyğun olmaq, uyğun gəlmək, münasib olmaq, uymaq. *Mənim yoldaşım Sadığın adını qoyublar Lağlağı, .. bu ləqəb o kişiyə heç yaraşmır.* C.Məmmədquluzadə. *Məsmə otağını bir cavanəzənə yaraşacaq bir şəklə salmağı özünə bir həyat qayəsi qərar verdi.* S.Hüseyn.

**YARATMA** "Yaratmaq"dan *f.is.*

**YARATMAQ** *f.* 1. Zəhmətlə, yaradıcı əməklə vücuda gətirmək. *Əsər yaratmaq. Sənaye ocaqları yaratmaq. Alimlər yeni elektron maşınları yaratmışlar. Öz səadətini insan özü yaradır. – Yaşamaq şirindir deyir hər zaman; Yaşamaq eşqilə yaradır insan!* S.Vurğun. [Kərimxan Xavərə:] *..Biz sənin üçün də, oğlumuz üçün də xoşbəxt həyat, gözəl, işıqlı həyat yaradacağıq.* M.İbrahimov. // Ümumiyyətlə, vücuda gətirmək, meydana gətirmək, əmələ gətirmək. *Külək Keşlənin alçaq damları qabağında qum təpələri yaradırdı.* M.S.Ordubadi. // Doğurmaq, oyandırmaq. [Səlimlə] *son günlərin bərabər gəzişmələri, əski bir məzar daşının üzərində aparılan müsahibə Mehribanda yeni bir hiss yaratdı.* S.Hüseyn. // *din.* Xəlq etmək, yoxdan var etmək.

2. Təsis etmək, təşkil etmək; düzəltmək, qurmaq. *Ordu yaratmaq. Təsərrüfat yaratmaq. – "Molla Nəsrəddin" birinci olaraq bizdə satirik xarakter daşıyan jurnalistika məktəbi yaratmışdır.* M.İbrahimov. // Hazırlamaq, təmin etmək. *İşləmək üçün şərait yaratmaq. Əfkari-ümumiyyə yaratmaq. Zəminə yaratmaq.*

3. Əsər yazmaq, yaradıcılıqla məşğul olmaq. *Yarat, sən köçəndə ellər söyləsin; Dünyadan nə gözəl bir insan gedir.* M.Rahim. *Qaranlıq daxmada gecə sübhədək; O, işıq naminə yazdı, yaratdı.* B.Vahabzadə.

**YARD** [*ing.*] 81 sm-ə bərabər olan ingilis uzunluq ölçüsü. // 1,2 akra bərabər olan ingilis səth ölçüsü.

**YARDARLIQ** *is. tar.* Keçmişdə: icarəyə götürülmüş torpaqdan yığılan məhsulun yarısını icarə haqqı olaraq torpaq sahibinə vermə və bu icarə üsulunun özü.

**YARDIM** *is.* Kömək. *Maddi yardım. Tibbi yardım.* □ **Yardım etmək (göstərmək)** – 1) birinə bir şeylə kömək etmək. *Maddi cəhətdən yardım etmək. İşin öhdəsindən yaxşı gəlmək üçün ona yardım etmək lazımdır.* – [Nüşabə:] *..Enməyə nər kimi coşqun Tərtər; Ən çətin gündə bizə yardım edər.* A.Şaiq; 2) əl tutmaq, maddi kömək etmək, müavinət göstərmək. *Ehtiyacı olanlara yardım etmək. Pulla yardım etmək.*

2. Nida məqamında: **yardım!** – imdada, köməyə çağırış. *Uzaqdan* "*Yardım! Yardım!*" *səsləri eşidildi.*

◊ **İlk yardım** – gözlənilmədən xəstələnən, yaxud bədbəxt bir hadisəyə məruz qalan adama həkim gələnə qədər göstərilən ilk tibbi yardım. **Təcili yardım** – təxirsiz tibbi kömək tələb edən xəstələrə ilk tibbi yardım göstərən, habelə lazım gəldikdə onları müalicəxanaya aparmaqla məşğul olan tibb-sanitar müəssisəsi. *Təcili yardım maşını. Təcili yardım stansiyası. – Əgər təcili yardım maşınında tez gətirib dava-dərman verməsəymişlər, uşaqlarım yetim qalacaqmış.* M.Hüseyn.

**YARDIMÇI** *sif.* 1. Yardım edən, kömək edən; kömək göstərən.

2. Əsas deyil, ikinci dərəcəli rolu, əhəmiyyəti olan, əsas şeyə kömək edən; əlavə. *Yardımçı təsərrüfat. Yardımçı material.*

**YARDIMÇILIQ** *is.* Yardımçı olma, yardım etmə, kömək etmə.

**YARDIMSIZ** *sif.* Köməksiz, müavinətsiz. // Zərf mənasında. *Yardımsız qalmaq.*

**YARDIMSIZLIQ** *is.* Köməksizlik.

**YARDIRMA** "Yardırmaq"dan *f.is.*

**YARDIRMAQ** *icb.* Yarma işi gördürmək. *Şalban yardırmaq. Odun yardırmaq.*

**YARDIRTMA** "Yardırtmaq"dan *f.is.*

**YARDIRTMAQ** *icb.* Yarmağa məcbur etmək.

**YARƏB, YARƏBBİ** [*ər.*] *din.* Ey Allah! Allahım! İlahi! (Allaha müraciət). *Əsərsiz ahimə sən vergilən əsər, yarəb!* Qövsi. *Gecə-gündüz canan deyib ağlaram; Yarəb, belə bilirmi ol yar məni?* Q.Zakir. *Nə bəlalar gətirir başıma çeşmin, yarəb! Nə qədər var imiş əl nərgisi-cadudə bəla.* S.Ə.Şirvani.

**YARĞAC** *is.* Çapacaq, dəhrə.

**YARĞAN** *is.* Müvəqqəti su axınlarının əmələ gətirdiyi dikyamaclı çuxur.

**YARĞANOTU** *is. bot.* Zibilli yerlərdə, habelə təpələrdə bitən birillik bitki, quşəppəyi.

**YARI** *is.* Tən bölünmüş iki hissədən biri. *Eyni yarısı. Almanın yarısı. Kitabın yarısını oxudum. Ömrünün yarısını səhayətdə keçirmişdir.* – [Məhəmmədhəsən əmi] *gəldi, tövləsini ortadan yarı böldü və küçəyə səmt bir qapı açdı...* C.Məmmədquluzadə. *Bəxtiyar yerə səpdiyi toxumun yalnız yarısını əldə edə bilmişdi.* S.Hüseyn. □ **Yarı canı qalmamaq** – həddindən artıq arıqlamaq, üzülmək, zəifləmək. *Rəngi saralıb, qalmayıb əsla yarı canı; Bir gülməz oğul, vay!* M.Ə.Sabir. **Yarı canı... yanında qalmaq** – birinin nigarançılığını çəkmək, biri üçün çox həyəcan və iztirab keçirmək. *Ananın yarı canı balanın yanında qaldı.* Ə.Vəliyev. **Yarı gecə** – gecə yarısı, yaxud ümumiyyətlə çox gec. *Yarı gecə evə qayıtdıq.* **Yarı olmaq** – 1) yarısı qurtarmaq, işlənib, xərclənib, sərf edilib yarısı qalmaq. *Yağ yarı olubdur;* 2) *məc.* şərik olmaq. *Mənimlə qəmlərə yarı olarsız; Gözəlliyin intizarı olarsız.* Aşıq Şəmşir. **Yarı yolda qalmaq (dayanmaq)** – səfəri başa çatdıra bilməmək, nəzərdə tutduğu yerə gedib çata bilməmək. *Ac atlar sıldırım daşlıqlara çıxa bilməyib yarı yolda qaldılar.* "Koroğlu". **Yarı yoldan qayıtmaq** – nəzərdə tutulan işi tamamlamamaq, başa çatdırmamaq, yarımçıq qoymaq. *Yarı yoldan qayıtmamaq üçün bir çarə tapdılar.* Mir Cəlal. [Zahidoğlu:] *Bu dəfə öldü var, döndü yoxdur, heç bir zaman yarı yoldan qayıtdı yoxdur!* S.Rəhimov.

**yarı**... – mürəkkəb sözlərin, "tam, tamamilə deyil, qismən, yarımçıq" mənasında olan birinci tərkib hissəsi; məs.: yapıqapalı, yarıaçıq, yarıaralı.

**YARIAC** *sif.* Lazımınca, doyunca yeməyən, yemək tapmayan (çox vaxt "yarıac, yarıtox" şəklində işlənir). *Yarıac insanlar. Yarıac* (z.) *yaşamaq*. – [Yükselin] *atası Mehmet bir taksi şoferi idi. Ailəsini yarıac, yarıtox dolandırırdı.* M.Rzaquluzadə.

**YARIAÇIQ** *sif.* Tam qapalı olmayan, azacıq açıq. *Yarıaçıq göz. – Maya ehmalca yarıaçıq qapını örtüb xalatını çıxartdı.* M.İbrahimov.

**YARIARALI** *sif.* Bir az aralı, qismən aralı. *Yarıaralı pəncərə. Qapını yarıaralı* (z.) *qoymaq.*

**YARIBATAQLIQ** *sif.* Qismən bataqlıq olan. *Yarıbataqlıq yer.*

**YARIBAYARI** *zərf* Yarısı qədər, tən yarı. *Çörəyi yarıbayarı bölmək. Əhəngi quma yarıbayarı qatışdırmaq. Xərci yarıbayarı aralarında böldülər. – Buradakı tarla da yarıbayarı əkilmişdi.* M.Hüseyn.

**YARIBAYĞIN** *sif.* və *zərf* Tam bayğın olmayan; azacıq bayğın, bir qədər bayğın. *Yarıbayğın halda uzanmaq. – Süreyya yarıbayğın .. idi.* Ə.Məmmədxanlı.

**YARIBAYĞINLIQ** *is.* Yarıbayğın hal, vəziyyət. [Nuriyyənin] *nəhayətsiz dərəcədə xoş bir yarıbayğınlıq içində gözləri dumanlandı.* İ.Əfəndiyev.

**YARIBƏRK** *sif.* Tam bərk olmayan, bir qədər bərk. *Yer qabığının üst qatlarının ağırlığı həmin maye kütləsinə* (*maqma*) *çox böyük təsir göstərir. Buna görə də bu kütlə yarımaye, yarıbərk halda olmalıdır.* M.Qaşqay.

**YARIBİHUŞ** b a x **yarıbayğın**. *Rza Qəhrəmani cəld yerindən sıçrayıb yarıbihuş halda torpaqdan qopmaq istəməyən Məhbusinin qollarını açdı.* M.İbrahimov.

**YARIBİŞMİŞ** *sif.* Tam bişməmiş, lazımınca bişməmiş, yarıçiy. *Yarıbişmiş yumurta.*

**YARICAN** b a x **yarımcan**. *Nabatoğlu yaxşıca əzişdirildi, yarıcan çölə atıldı.* S.Rəhimov.

**YARICANLI** b a x **yarıcan**.

**YARICİDDİ** *zərf* Tamamilə, çox da ciddi olmayan, bir qədər ciddi. *Bu olmadı, Dilara bacı, – deyə Tahir yarıciddi, yarızarafat etiraz elədi.* M.Hüseyn.

**YARIÇILPAQ** b a x **yarımçılpaq**. *İndi ananın yarıçılpaq bədəni şaxta qarşısında müdafiəsiz qalmışdır.* Ə.Məmmədxanlı.

**YARIDƏYMİŞ** *sif.* Tam dəyməmiş, lazımınca yetişməmiş. *Yarıdəymiş alma. Yarıdəymiş qarpız. – Baba əncirin yarıdəymişindən .. dərib nənəyə verərdi.* H.Sarabski.

**YARIGERÇƏK** *zərf* Tam gerçək olmayan, qismən gerçək olaraq. *Yarızarafat, yarıgerçək dedi.*

**YARIGEYİNMİŞ** *sif.* Tam geyinməmiş. *Yarıgeyinmiş* (z.) *halda bayıra çıxmaq.*

**YARIHESABA** *zərf* Yarıqiymətinə, yarıbahasına.

**YARIKÖNÜL** *zərf* Könülsüz olaraq; istəməyərək. *Tapdıq yarıkönül razı oldu.* Ə.Vəliyev.

**YARIQ** 1. *is.* Bir şey üzərində uzununa dərin kəsik. *Hardasa lap yaxında, deyəsən buxarının yanında, divardakı yarıqlardan birində gizlənmiş qarafatma kəsik-kəsik oxumağa başladı.* İ.Şıxlı.

2. *is.* Yarılıb açılmış yer. *Qəhrəman səhərə yaxın daş yolun altındakı qayanın yarığına girib uzandı.* Ə.Vəliyev.

3. *sif.* Yarılmış.

**YARIQAPALI** *sif.* Tam qapalı, örtülü olmayan; azca qapalı, bir qədər örtülü; yarıaçıq. *Yarıqapalı göz. Yarıqapalı pəncərə. Yarıqapalı üz. – Cuma yarıqapalı kirpikləri arasından bu tədarükü gördü.* Ə.Əbülhəsən.

**YARIQARANLIQ** *sif.* Tam qaranlıq olmayan; alaqaranlıq. *Axşam onlar yarıqaranlıq zirzəmidə otururdular.* Ə.Məmmədxanlı. *Əjdər yarıqaranlıq bir dəhlizə girdi.* S.Rəhman.

**YARIQLI** *sif.* Yarığı, yarıqları, kəsiyi olan. *Yarıqlı torpaq.*

**YARIQVARİ** *sif.* Yarıq şəklində olan, yarıq şəklində.

**YARIQ-YARIQ** *zərf* Yarığı, kəsiyi çox olan; hər tərəfi yarıq; yarılmış, yarıqlarla örtülmüş; çatlaq-çatlaq. *Əlləri yarıq-yarıq olmuşdu. Taxta yarıq-yarıqdır. – Torpağın sinəsi yarıq-yarıqdır; Əkinçi qocadır, öküz arıqdır.* S.Vurğun. *Günəş batandan azca sonra sinəsi yarıq-yarıq böyük səhranın üstündəki buludsuz göylər ulduzlarla doldu.* M.İbrahimov. *Boz dağın ətəyi insan əlindən; İndi yarıq-yarıq, oyuq-oyuqdur.* R.Rza.

**YARILAMA** "Yarılamaq"dan *f.is.*

**YARILAMAQ** *f.* 1. İki (bərabər) hissəyə bölmək, yarıya bölmək. *Almanı yarılamaq. Kağızı yarılamaq.*

2. Bir işin yarısını görmək. *İşi yarılamama.* // Yolun yarısını qət etmək, yolun yarısına çatmaq. *Doğrudan da* [Laçın] *bir günlük yolu çoxdan yarılamışdı.* M.Hüseyn.

**YARILANMA** "Yarılanmaq"dan *f.is.*

**YARILANMAQ** *məch*. 1. İki hissəyə bölünmək, yarıya bölünmək.

2. Bir işin yarısı görülmək.

**YARILATMA** "Yarılatmaq"dan *f.is.*

**YARILATMAQ** *icb*. Yarıya böldürmək.

**YARILĞAN** bax **yarğan**. *Yarılğan uçar, toz qopar; Görərsən ki, qalan yoxdur.* "Koroğlu". *Torpaqlı dərələr, sarı yarılğan; Bu gündən başlamış, gözləyəcək qan.* H.K.Sanılı. *Bir portfelli oğlan göründü. Yarılğandan enib, düz məktəbə tərəf gəlirdi.* Mir Cəlal.

**YARILIQ** *zərf* Adətən **yarılığa** şəklində – əldə edilən gəlirin, məhsulun və s.-nin yarısını vermək (almaq) şərti ilə; yardarlığa. *Yarılığa işləmək. – Özününkünü verib yarılığa; Özgədən tutub kiralığa.* (Ata. sözü).

**YARILIQÇI** *is.* Yarılığa, yardarlığa işləyən adam.

**YARILMA** "Yarılmaq"dan *f.is. Lotubaşı ertədən yolu bələdləyib xəzinənin yarılmasını axşama qoydu.* "Aşıq Qərib".

**YARILMAQ** *f.* 1. Zərbə ilə vurulub ortadan uzununa aralanmaq; bölünmək, kəsilmək, parçalanmaq.

2. Yaralanmaq. *Başı yarılmaq*. // Maneə rəf edilərək yol açılmaq. *Cəbhə yarıldı. Müdafiə xətti yarıldı*.

3. Oğurluq məqsədi ilə sındırılıb (dağıdılıb) açılmaq. *Yenə kimin isə öldürüldüyünü, qız qaçırıldığını, ya adam soyulduğunu, bəlkə dükan yarıldığını güman edirdilər.* Mir Cəlal.

4. Şaqqalanmaq. *Meşənin arası, çal qayalığın ayağı iki yana yarılmışdı*. S.Rəhimov.

◊ **Bağrı yarılmaq** – bax **bağır**.

**YARIM** *say* Tam bir şeyin iki bərabər hissəsindən biri; tam bir şeyin tən yarısı. *Yarım manat. Yarım litr. Yarım gün. Yarım ton. – Yarım saatadək ayaq üstə yenə ötədən-bəridən qonuşduq.* S.Hüseyn. *Bir-birinə can deyib, can eşidən qardaşlar yarım il küsülü qaldılar.* M.Hüseyn.

**yarım-yarım** *zərf* Yarı-yarı, bütövün yarısı miqdarında. *Hərəsinə yarım-yarım alma vermək.*

**yarım...** – bax **yarı...** *Axırda yarımbayğın bir halda düşüb istər-istəməz sükuta məcbur oldu*. C.Cabbarlı. *Təkərlər dirsəkli yarımoxun üfüqi hissəsində fırlanır.* S.Məmmədov.

**YARIMA** "Yarımaq"dan *f.is.*

**YARIMAC** bax **yarıac**.

**YARIMAÇIQ** bax **yarıaçıq**. *Qapı yarımaçıq idi.* S.Rəhimov.

**YARIMADA** *is.* Üç tərəfi dəniz, dördüncü tərəfi isə qitəyə bağlı olan yer sahəsi. *Hansı millətin Muğan çölü kimi, Mil düzü kimi, Şirvan səhrası kimi, Abşeron yarımadası kimi yeri, torpağı var? Heç bir millətin!.. Yaşa vətənim, çox yaşa!* N.Vəzirov.

**YARIMADAM** *is.* 1. Hər hansı bir cəhətdən çatışmazlığı olan adam haqqında.

2. Balaca uşaq haqqında.

**YARIMAĞIR** *sif. idm.* İdmançıların çəki dərəcələrindən biri. *Yarımağır çəkidə.*

**YARIMAĞIZ** *zərf dan.* Narazı, ürəkdən olmayaraq; həvəssiz, könülsüz. *Qardaşım onların dalınca: – Namaz! Namaz! Hara gedirsiniz? – deyə çağırdı. Namaz arxaya dönərək yarımağız: – Qoruğa gedirik, – dedi*. A.Şaiq. *Xan yarımağız cavab verdi*. M.Rzaquluzadə.

**YARIMAQ** *f.* 1. Lazım olmaq, gərək olmaq, faydalı olmaq, fayda vermək. *Heç şeyə yarıyan deyil. – Vaqifəm, yarıdım dosta, düşmənə; Ta ki cünun oldum, yetişdim sənə.* M.P.Vaqif.

2. Təmin olmaq, məmnun olmaq, arzusuna çatmaq. *Qəm evində zar olalı; Eşqə giriftar olalı; Yarımadıq yar olalı; Nə mən səndən, nə sən məndən.* Q.Zakir. [Fatma xanım:] *Yarıdıq, yaza çıxdıq, bəxtəvər başımıza*. N.Vəzirov. [Atası:] *Bəlkə çörəkdən, paltardan yarımırsan?* Çəmənzəminli.

**YARIMARŞIN** *sif.* Arşının yarısı uzunluğunda olan. *Yarımarşın bez. Yarımarşın enində.*

**YARIMARŞINLIQ** *sif.* Yarımarşın uzunluğunda olan.

**YARIMASILI** *sif.* Tam müstəqil olmayan, başqalarından qismən asılı olan, qismən tabe olan. *Yarımasılı ölkələr. Yarımasılı vəziyyət.*

**YARIMAVTOMAT** *sif. tex.* Tam avtomat olmayan, qismən avtomatlaşdırılmış. *Yarımavtomat cihaz. Yarımavtomat maşın.*

**YARIMAVTOMATİK** bax **yarımavtomat**.

**YARIMAY**[1] *is.* Təqvim ayının yarısı. *Birinci yarımayın maaşı. İkinci yarımayın planı.*

**YARIMAY**[2] *sif.* Aypara şəklində olan. *Qazamat divarları uca; Qapının yarımay deşiyindən; Zaman-zaman görünür bir qoca.* R.Rza.

**YARIMAYE** *sif.* Tam maye olmayan, çox duru olmayan, bir qədər qatı halda olan. *Yarımmaye maddə.*

**YARIMAYLIQ** *is.* Yarım ay davam edən, yarım ay müddətində görülən, yarım aya nəzərdə tutulan. *Yarımaylıq iş qalıb. Yarımaylıq proqram.* // Yarım ayda çatacaq. *Yarımaylıq maaş.*

**YARIMAZ** *sif.* Məqsədinə, arzusuna, kamına çatmayan: nakam, bədbəxt, binəsib. *Əfsus, bu günlərin ömrü az oldu; Körpə quşcuğazım yarımaz* (z.) *oldu.* M.Rahim.

**YARIMBARBAR** b a x **yarımvəhşi**.

**YARIMBAYĞIN** b a x **yarıbayğın**. *Yarım saat sonra* [Süreyya] *yarımbayğın bir halda sayıqlamağa başladı.* Ə.Məmmədxanlı.

**YARIMBƏRK** b a x **yarıbərk**.

**YARIMBÜKÜK** *sif.* Tam bükülü olmayan, qismən bükülmüş. *Qürbət sağ əlini enli və qalın toqqasına keçirib sol qıçını yarımbükük halda qatladı.* Ə.Vəliyev.

**YARIMCA** "Yarım"dan *kiç. Yarımca saat gözləyin. Yarımca gün vaxt lazımdır. – Salman* [Mayaya] *savışdı: – Bu istidə hara? Bir yarımca saat otur, mən də dururam.* M.İbrahimov.

**YARIMCAN** *sif.* 1. Ölümü yaxınlaşmış olan, ölümünə az qalmış; ölümcül. *Yazıq yarımcandı, ölər, qalmaz. – Yarımcan arvad balalarından utanıb daha su istəmir.* N.Nərimanov. // Zərf mənasında. *Heyvanı o qədər vurdu ki, yarımcan oldu.*

2. *məc.* Çox yorğun, zəif, üzgün, əldən düşmüş, ölüvay. [Hacı Mehdi:] *Mən gəldim evə yarımcan.* Ə.Haqverdiyev.

3. *məc. məh.* Könülsüz, həvəssiz. *İşini yarımcan* (z.) *görür.*

**YARIMCANLIQ** *is.* 1. İnsan və ya heyvanın ölməyə yaxın halı.

2. *məc.* Üzgünlük, əldən düşmə, çox yorğunluq; ölüvaylıq.

**YARIMCIR** *sif.* Tamamilə cır olmayan. *Yarımcır alma növü.*

**YARIMÇEVRƏ** *is.* Dairənin, çevrənin yarısı.

**YARIMÇIQ** *sif.* 1. Sona, axıra çatdırılmamış; natamam, bitməmiş. *Yarımçıq iş. // Zərf mənasında.* Yarısında, ortasında, axıra çatdırmayaraq, natamam. *Kitabı yarımçıq qoymaq* (*axıra qədər oxumamaq*). *Çayı yarımçıq qaldı* (*axıra qədər içmədi*). *İşini yarımçıq qoyub getmək. – Rzaqulu xan hansı təşəbbüsə başladısa, yarımçıq qaldı.* M.S.Ordubadi. *Mehriban bir saat idi ki, əlindəki işini yarımçıq buraxıb otağın içində gəzişir, gah şüşəbəndə çıxıb qapıya gedir, gah evə qayıdıb pəncərədən küçəyə baxırdı.* S.Hüseyn.

2. Dolu olmayan, başı yarımçıq olan. *Yarımçıq qab. – Koroğlu baxdı ki, arpa çuvalları yarımçıqdı.* "Koroğlu". *Mahmud yarımçıq səbəti dalına atıb .. geri qayıtdı.* Ə.Əbülhəsən.

3. *məc.* Sənətini yaxşı bilməyən, bir şey haqqında lazımınca məlumatı, biliyi olmayan adam haqqında. *Anlayana da can qurban, anlamayana da; Dad yarımçıq əlindən.* (Ata. sözü). *..Çox "yarımçıqlar" var ki, rusca danışanda bir o tərəfə-bu tərəfə baxır, görsün ki, hansı bir həmşəri və hambal buna təəccüblü baxıb öz könlündə deyəcək: "Ədə, nə zalımdır!"* C.Məmmədquluzadə. [Rüstəm bəy:] *Mən bəhailiyi qəbil edənlərə diqqət etdim. Bunların içində bir nəfər də olsun kamil adam yoxdur, hamısı yarımçıqlardır.* Çəmənzəminli.

4. *məc.* Məsələni axıra qədər həll etməyən, ardıcıl olmayan. *Yarımçıq tədbir. Yarımçıq islahat. Yarımçıq vədlər.*

**YARIMÇIQLAMA** "Yarımçıqlamaq"dan *f.is.*

**YARIMÇIQLAMAQ** *f.* Yarımçıq etmək, tamamlamamaq, axıra, sona çatdırmamaq.

**YARIMÇIQLIQ** *is.* Yarımçıq olma, natamamlıq, qeyri-kamillik, yarımçıq şeyin halı.

**YARIMÇILIQ** *dan.* b a x **yarımçıq**. *Çörək yedikdən sonra Mirzə üzünü Usta Zeynala tutub: – Usta Zeynal, bu uşaqlar qurtarıblar, bunları belə qoymaq olmaz, yarımçılıqdan fayda olmaz.* Ə.Haqverdiyev.

**YARIMÇILPAQ** b a x **yarımlüt**. *Yarımçılpaq uşaq. Yarımçılpaq* (z.) *yerindən durmaq.*

**YARIMÇÜRÜMÜŞ** *sif.* Bir qədər çürümüş, qismən çürümüş, başdan-başa çürüməmiş.

**YARIMDAİRƏ** *is.* 1. Dairənin yarısı.

2. Qövsvari yarıqapalı xətt. *Yunis telefonu yerə qoyub cəld təqvim vərəqindəki qeydlərin hamısını bir yarımdairəyə aldı.* Mir Cəlal. *Böyük bir yarımdairə halında toplaşmış iştirakçı və tamaşaçılar kütləsinin mərkəzində bir masa qoyulmuşdu.* M.Rzaquluzadə.

**YARIMDAİRƏVİ** *sif.* Yarımdairə şəklində olan. *Yarımdairəvi xətt. Yarımdairəvi zal.*

**YARIMDƏYİRMİ** b a x **yarımdairəvi**.

**YARIMDİRSƏK** *is. dan.* Qolun əlin ucundan dirsəyə qədər olan hissəsinin yarısı (xalq arasında uzunluq ölçüsü).

**YARIMFABRİKAT** *sif.* Sonradan işlənib hazırlanmalı olan məmulat, yarımhazır məmulat. *Ət yarımfabrikatları.*

**YARIMFƏSİLƏ** *is. biol.* Heyvan və bitki sistematikasında bölgü; fəsilə daxilində bir-birindən fərqlənən qrup.

**YARIMFİNAL** *is. idm.* Birincilik uğrunda finaldan qabaq keçirilən oyun, görüş. *Yarımfinala çıxmaq. Yarımfinal yarışları.*

**YARIMGİRVƏNKƏ** *is. köhn.* Girvənkənin yarısı, iki yüz qram.

**YARIMGİRVƏNKƏLİK** 1. *sif.* Yarım girvənkə çəkisində olan. *Yarımgirvənkəlik daş.*
2. *is.* Yarım girvənkə ağırlığında olan daş. *Yarımgirvənkəliyi tərəziyə qoymaq.*

**YARIMGÜNBƏZ** *is.* Günbəzin yarısı; ortadan kəsilmiş kimi görünən günbəz. *Divanxananın portalı üzərində quruluşca çox mürəkkəb və daşdan tikilmiş yarımgünbəz vardır.* S.Dadaşov.

**YARIMHİSSƏ** *is.* Hissənin yarısı.

**YARIMXAM** *sif.* Tamamilə aşılanmamış, qismən aşılanmış. *Bu alçaq binaların damlarında .. xal və yarımxam keçi, qoyun dərilərinə rast gəlmək olardı.* P.Makulu.

**YARIMXARABA** *sif.* Yarımuçmuş, tamam uçulub dağılmamış, qismən uçulmuş. *Yarımxaraba ev.*

**YARIMİLLİK** *sif.* İlin yarısına aid olan; altıaylıq. *Yarımillik hesabat.* // Yarım il (altı ay) davam edən. *Yarımillik yaradıcılıq məzuniyyəti. Yarımillik fəaliyyət. Yarımillik xidmət. Yarımillik həbs cəzası.* // Yarım ili (altı ay müddətini) nəzərdə tutan. *Yarımillik iş planı.*

**YARIMİSTİ** *sif.* Qismən isti olan, bir qədər isti. *Yarımisti paltar.*

**YARIMİŞSİZ** *is.* Tamamilə deyil, qismən işsiz olan adam, ayın, həftənin yalnız bəzi günlərində işləyən, özünə iş tapan adam.

**YARIMKEÇİRİCİ** *fiz.* 1. *sif.* Keçiricilərlə dielektriklər (izolyatorlar) arasında aralıq vəziyyət tutan. *Yarımkeçirici maddə.*
2. *is.* Elektron elektrikkeçirmə qabiliyyətinə malik olan və onun kəmiyyətinə görə keçiricilərlə dielektriklər (izolyatorlar) arasında aralıq yer tutan maddə.

**YARIMKEFLİ** *sif.* Bir qədər kefli, azacıq sərxoş halda olan.

**YARIMKİLOLUQ** *sif.* Yarım kilo ağırlığında olan. *Yarımkiloluq daş.*

**YARIMKOBUD** b a x **yarımqaba**. *Yarımkobud yunlu qoyunlar.*

**YARIMKOL** *is. bot.* Gövdəsinin dib hissəsi oduncaqlaşmış, üst hissəsi isə ot olan bitki.

**YARIMKOLLUQ** *is.* Yarımkol bitmiş yer, sahə.

**YARIMKOSA** *sif.* Tamamilə yox, qismən kosa olan, bir qədər kosa. *Deyilənlərə görə, molla yarımkosa imiş.* "M.N.lətif."

**YARIMKÖÇƏRİ** *sif.* Tam oturaq halına keçməmiş, qismən köçəri həyat keçirən. *Yarımköçəri həyat. Yarımköçəri xalq.*

**YARIMKÖÇƏRİLİK** *is.* Yarımköçəri həyat tərzi.

**YARIMKÖLGƏ** *is.* Çox sıx olmayan kölgə, zəif işıqlanmış yer. *Yarımkölgədə oturmaq.* // Kölgəyə oxşayan şey. *Günəş ləkələri əsasən çox tutqun nüvədən və onu əhatə edən az tutqun yarımkölgədən ibarətdir.* R.Hüseynov.

**YARIMKRİSTAL** *is.* Qismən kristal halında olan, tam kristal olmayan cisim.

**YARIMKRİSTALLİK** *sif.* Yarımkristal halında olan.

**YARIMKÜRƏ** *is.* 1. Kürənin yarısı.
2. Həmin şəkildə olan şey. *Beyin yarımkürəsi. – Yarımkürəyə oxşayan qarpız parçasının biri dilimlənərək yeyilmişdi.* M.İbrahimov.
3. *coğr.* Yer kürəsinin və göy sferasının şərti olaraq bölündüyü iki hissədən biri. *Cənub yarımkürəsi. Hər iki yarımkürənin xəritəsi.*

**YARIMKÜRK** *is.* Uzun olmayan kürk, qısa kürk. *Qoyun dərisindən tikilmiş yarımkürk.* – [Cavad] *ayağa qalxdı, yarımkürkünün döşünü düymələdi, dirəkdən asdığı qulaqlı papağını başına qoydu..* Ə.Vəliyev.

**YARIMQABA** *sif.* Bir qədər qaba, lazımınca yumşaq olmayan. *Yarımqaba yunlu qoyun. Yarımqaba yem.*

**YARIMQAPALI** b a x **yarıqapalı**.

**YARIMQARANLIQ** bax **yarıqaranlıq**. *Lakin mən istəsəm də, istəməsəm də başımı aşağı salıb, bu cansıxan, yarımqaranlıq otaqda saatlarımı saya-saya çörəkpulu qazanmalıydım.* M.Hüseyn. *Bu, yalnız həyatə pəncərəsi olan yarımqaranlıq bir otaqdı.* S.Rəhman.

**YARIMQARIN** *sif.* Tamamilə doymamış, tam tox olmayan; yarıac. ☐ **Yarımqarın olmaq** – doymağına az qalmaq, bir qədər qarnını doydurmaq. *Onun qaşığı badyaya bir dəfə batıb-çıxınca başqaları yarımqarın olurdular.* Mir Cəlal.

**YARIMQATI** *sif.* Tam qatı olmayan, bir qədər qatı, qatıtəhər, nə qatı, nə duru. *Yarımqatı maddə.*

**YARIMQAYNAR** *sif.* Tam qaynar olmayan, bir qədər qaynar.

**YARIMQIVIRCIQ** *sif.* Çox qıvırcıq olmayan, bir qədər qıvırcıq. *Qara və dərin gözləri, .. yarımqıvırcıq saçları ona bir sənətkar, rəssam görünüşü verirdi.* S.Rəhman.

**YARIMQOL** *sif.* Qolu adi haldan çox qısa olan. *Yarımqol köynək.*

**YARIMQRUP** *is.* Bir qrupun yarısı. *İştirakçılar iki yarımqrupa bölündülər.*

**YARIMQURAQ** *sif.* Qismən quraq, bir qədər quraq.

**YARIMQURUMUŞ** *sif.* Qismən qurumuş, tam surətdə qurumamış, bir qədər nəm, nəmliyi qalmış.

**YARIMQÜLLƏ** *is.* Kiçik, balaca qüllə.

**YARIMLAMA** "Yarımlamaq"dan *f.is.*

**YARIMLAMAQ** *f.* 1. Yarıya bölmək (kəsmək); yarılamaq.

2. Bir şeyin yarısını sərf etmək (işlətmək).

3. Bir işin yarısını görmək; yarılamaq.

**YARIMLANMA** "Yarımlanmaq"dan *f.is.*

**YARIMLANMAQ** *məch.* 1. Yarıya bölünmək (kəsilmək).

2. Yarısı sərf edilmək (işlənmək).

3. Yarısı görülmək (bir işin).

**YARIMLAŞMA** "Yarımlaşmaq"dan *f.is.*

**YARIMLAŞMAQ** *f.* Tədricən yarım olmaq, getdikcə azalmaq.

**YARIMLEQAL** *sif.* Tam leqal olmayan; yarımgizli, yarıaçıq.

**YARIMLƏBBADƏ** *is. köhn.* Qısa ləbbadə. *Dilbər Mirzəkərimin yarımləbbadəsini, ikiüzlü papağını nə isə çəkə bilmirdi.* C.Cabbarlı.

**YARIMLIQ** *is.* Bir ölçünün yarısı miqdarında olma.

**YARIMLÜT** *sif.* və *zərf* Yarıgeyinmiş, yarıçılpaq. *Yarımlüt uşaq. Yarımlüt halda oturub.*

**YARIMMAHUD** *is.* Saplarının yarısı mahud, yarısı pambıq olan parça. // Bu parçadan tikilmiş. *Müsəlman paltarları ucuz yarımmahuddur ki, iki dəfə gün vuran kimi bozarır.* C.Məmmədquluzadə.

**YARIMMANATLIQ** 1. *is.* Yarım manat, əlliqəpiklik metal pul. *Bir yarımmanatlığım var.*

2. *sif.* Yarım manat dəyərində olan. *Yarımmanatlıq pul.*

**YARIMMAYE** bax **yarımaye**.

**YARIMMETR** *sif.* Metrin yarısı uzunluğunda olan, 50 santimetrlik.

**YARIMMƏXMƏR** *is.* Toxunuşu məxmərə oxşayan parça. // Bu parçadan tikilmiş. *Yarımməxmər paltar.*

**YARIMMƏRTƏBƏ** *sif.* Mərtəbənin yarısı hündürlüyündə olan.

**YARIMMÜDAFİƏÇİ** *is. idm.* İdman oyunlarında (futbol, xokkey və s.) komandanın müdafiə və hücumuna yardım edən oyunçusu.

**YARIMMÜSTƏMLƏKƏ** *is.* Zahirən müstəqil, iqtisadi və siyasi cəhətdən isə hər hansı bir imperialist dövlətdən asılı olan ölkə. // Sif. mənasında. *Yarımmüstəmləkə ölkələr.*

**YARIMNƏFƏS** *sif.* və *zərf* Həddən artıq yorğun (halda).

**YARIMNÖV** *is. xüs.* Heyvan və bitki sistematikasında növlərin bölgüsündən biri.

**YARIMOX** *is. tex.* Qismən ox şəklində olan cihaz və s.

**YARIMORTA** *sif. idm.* İdmançıların çəki dərəcələrindən biri.

**YARIMOYAQ** *sif.* Tam oyaq olmayan; yarıyuxulu. *Yarımoyaq gözətçilər, dəri kürkdə arabir; Dükanların, bazarların qapısında gərnəşir.* H.Hüseynzadə.

**YARIMPALTO** *is.* Qısa palto. [Kamalın] *əynində ağır yarımpalto, ayaqlarında isə həddindən böyük bir kobud uzunboğaz çəkmə vardı.* C.Cabbarlı.

**YARIMPEŞMAN** *zərf* Bir qədər peşman halda, çox da peşman olmayan. *Pası arvad .. yarımpeşman bir tərzdə başını aşağı salaraq: – Ayaqyalın Safo ilə gümüşdəstə xəncər bir yerdə yola getmir.* S.Rəhimov.

**YARIMPƏRDƏ** *is.* Qısa pərdə. *Qız evində qıza cehiz üçün yarımpərdələr və taxçalara, noğuldanlara, buxarıya əlvan pərdələr tikəcəklər*. R.Əfəndiyev.

**YARIMPƏRT** *zərf* Azacıq pərt, bir qədər pərtləşmiş halda. *Yarımpərt getdi.*

**YARIMPROLETAR** *is.* Muzd ilə kapitalist müəssisəsində işləyən, lakin təsərrüfatı ilə də hələ əlaqəsini kəsməmiş, tamamilə proletarlaşmamış adam. // Sif. mənasında. *Yarımproletar kəndlilər.*

**YARIMRÜTUBƏTLİ** *sif.* Çox rütubətli olmayan, bir qədər rütubətli. *Yarımrütubətli anbar.*

**YARIMSAİT** *sif. dilç.* Başqa saitlə birlikdə bir heca əmələ gətirən sait (səs). *Rus dilində* "*i*" (й) *yarımsaiti.*

**YARIMSAQQAL** b a x **bakenbard**.

**YARIMSAVADLI** *sif.* Lazımınca oxuyub-yaza bilməyən, savadı olmayan; savadlı, kəmsavad. *Yarımsavadlı kənd.*

**YARIMSƏHRA** *sif.* Tamamilə bitkisiz deyil, kolluqları olan coğrafi zona. *Püstə meşələri qədim keçmişdə Azərbaycanın quru yarımsəhra rayonlarında daha geniş yayılmışdı.* M.Qaşqay.

**YARIMSƏRXOŞ** b a x **yarımkefli**. [Qonaqlar] *tamamilə keflənməmişdilərsə də, yarımsərxoş bir halda bulunurdular.* S.Hüseyn.

**YARIMSƏRLÖVHƏ** *is.* Birinci, əsas sərlövhənin altında olan əlavə, ikinci sərlövhə.

**YARIMSTANSİYA** *is.* 1. Kiçik dəmiryol stansiyası.

2. Mərkəzi elektrik stansiyasından gələn elektrik enerjisinin gərginliyini, cərəyanın növünü dəyişdirən və nizama salıb paylaşdıran texniki qurğular sistemi.

**YARIMŞALBAN** *is.* Yarı bölünmüş şalban, şalbanın yarısı.

**YARIMŞƏFFAF** *sif.* Tamamilə şəffaf olmayan, bir qədər şəffaf. *Yarımşəffaf şüşə. Yarımşəffaf parça. Yarımşəffaf duman.*

**YARIMTƏHSİL** *is.* Tamamlanmamış təhsil, yarımçıq təhsil. [Əmiraslan ağa:] *Bəs sənin istədiyin o idi ki, Cahangir ağa yarımtəhsildə qalsın?* S.S.Axundov.

**YARIMTƏMİZLƏNMİŞ** *f.sif.* Qismən təmizlənmiş, bir qədər təmizlənmiş, tam təmizlənməmiş, qatışığı qalmış. *Yarımtəmizlənmiş düyü.*

**YARIMTON** *is.* 1. *mus.* İki qonşu səs arasında ən qısa interval, səsin ən az qalxması və ya enməsi.

2. *rəss.* Açıq ton ilə tutqun ton arasını təşkil edən aralıq rəng, boya.

**YARIMTONLUQ** *sif.* Yarım ton (500 kiloqram) ağırlığında olan. *Yarımtonluq yük.* // Yarım ton tutan, yarım ton ağırlıq qaldıran. *Yarımtonluq yük maşını. Yarımtonluq kran.*

**YARIMUÇUQ** *sif.* Tamamilə uçulub dağılmamış, qismən uçulmuş. *Yarımuçuq ev. Yarımuçuq divar.*

**YARIMUSTA** *is. dan.* İxtisasa tam yiyələnməmiş, hələ tamamilə usta olmamış adam.

**YARIMVƏHŞİ** *sif.* Lazımınca mədəni olmamış, vəhşi kimi. *Yarımvəhşi xalq.*

**YARIMYETİŞMİŞ** b a x **yarıyetişmiş**.

**YARIMYUN** *sif.* Yarısı yun və yarısı pambıqdan və ya süni iplikdən olan (toxunmuş). *Yarımyun parça. Yarımyun jaket.*

**YARIMYUVARLAQ** *sif.* Tam yuvarlaq olmayan, bir qədər yuvarlaq olan.

**YARIMYÜNGÜL** *sif. idm.* İdmançıların çəki dərəcələrindən biri. *Yarımyüngül çəkili güləşçi.*

**YARIMZƏRİF** *sif.* Tam zərif olmayan, bir az qaba olan. *Yarımzərif yunlu qoyun cinsi.*

**YARIMZİRZƏMİ** *is.* Evin qismən yer altında olan alt mərtəbəsi; zirzəmiyə oxşayan yer.

**YARIN** *is.* [*türk.*] *kit.* Sabah, gələcək gün. *Bütün arzularım gülür yarına; Xəyaldan ilhamlar almamaq üçün*. S.Vurğun. *Mübarizə bu gün də var; yarın da; Mən də onun ən ön sıralarında*. R.Rza. // Gələcək. *Kim bilir, yarın bu pirin böyük daşı şəhərin hansı ehtiyacına sərf ediləcəkdi.* S.Hüseyn. *Müjdə verdin bizlərə gözlənilən yarından*. M.Rahim.

**YARINMA** "Yarınmaq"dan *f.is.*

**YARINMAQ** *f.* 1. Yaltaqlıq etmək.

2. Özünü bəyəndirməyə çalışmaq.

**YARINTI** *is.* Yarılan (çatlayan) yer; yarıq, çatlaq. [Toğrul:] *Sədd yarıntı verər, suyun qabağını saxlamaq olmaz*. C.Cabbarlı.

**YARIOYAQ** *zərf* Tamamilə yuxulu olmayan, yarıyuxululuq ilə oyaqlıq arasında. *Yarıoyaq halda cavab verdi*.

**YARIOYAQLIQ** *is.* Yuxululuq ilə oyaqlıq arasındakı hal.

**YARIÖRTÜLÜ** *sif.* Tamam örtülməmiş, bir hissəsi örtülü, axıra qədər örtülməmiş. *Yarıörtülü baş. Yarıörtülü dam. Yarıörtülü pəncərə. Yarıörtülü sifət. Yarıörtülü gözlər.*

**YARIPARÇALANMIŞ** *sif.* Tamam parçalanmamış, qismən parçalanmış.

**YARIPEŞMAN** b a x **yarıpeşman**. *Həsən kişi üzündə nə isə yarıpeşman bir ifadə ilə geri döndü.* M.İbrahimov.

**YARISƏRXOŞ** b a x **yarımsərxoş**. *Gülnaz dəhlizdə yarısərxoş halda salondan çıxan ərbablarla üz-üzə gəldi.* M.İbrahimov.

**YARIŞ** *is.* Bir işdə üstün gəlmək, birinciliyi qazanmaq üçün bir-birini keçməyə çalışma. *Nəcəflə yarışda da söz yox ki, Qaraş çalışırdı qalib çıxsın.* M.İbrahimov. // İdmanın hər hansı bir növü üzrə birinciliyi qazanmaq üçün yarışma. *Yarış meydanı. İdman yarışı. Üzgüçülük yarışı. Beynəlxalq yarış.*

◊ **Sosializm yarışı** *köhn.* – sosialist təsərrüfatında: qabaqcılların təcrübəsini geniş yaymaq məqsədi daşıyan və əmək məhsuldarlığının ümumi yüksəlişinə nail olmağı nəzərdə tutan iş üsulu.

**YARIŞÇI** *is.* Yarışda iştirak edən, yarış iştirakçısı.

**YARIŞMA** "Yarışmaq"dan *f.is.*

**YARIŞMAQ** *f.* Bir işdə birinciliyi qazanmağa, bir-birini ötməyə çalışmaq. *İşləməkdə yarışmaq. Qaçışda yarışmaq. – Uşaqlar da səs salaraq, iri və dolu salxım gəldikcə zənbilləri tez doldurur, sevinir və yarışırdılar.* Mir Cəlal.

**YARITMA** "Yarıtmaq"dan *f.is.*

**YARITMAQ** *f.* 1. Görməli olduğu və ya tapşırılmış bir işi qənaətbəxş, kifayətləndirici dərəcədə yerinə yetirmək. [Barxudar] *yaratmaq, yarıtmaq, bütün qabiliyyətini .. işinə vermək eşqindədir.* Mir Cəlal.

2. Razı olmaq, təmin etmək. *Nə bülbülün yarıtmış; Nə özü yarımış gül.* Sarı Aşıq. // Kifayət etmək, təmin etmək.

**YARITMAZ** *sif.* Bir iş üçün əlverişli və münasib olmayan, yaxud tapşırılan və ya görməli olduğu bir işi lazımınca, qənaətbəxş surətdə yerinə yetirə bilməyən (yaxud yetirməyən). *Yarıtmaz adam. İşin nəticələri yarıtmazdır. – Cəbini buyurursuz bitməz işə, adını qoyursuz yarıtmaz!* N.Vəzirov. // *Zərf* Pis, qeyri-qənaətbəxş. *Yarıtmaz işləmək.*

**YARITMAZLIQ** *is.* Yarıtmama; tapşırılan işi lazımınca və layiqincə yerinə yetirməmə. // Verilən tələbləri təmin etməmə; yararsızlıq.

**YARITOX** *sif.* Tamamilə tox olmayan, doyunca yeməyən (çox vaxt "yarıac" sözü ilə birlikdə işlənir).

**YARIUÇUQ** b a x **yarımuçuq**.

**YARIUZANMIŞ** *zərf* və *sif.* Bədəninin yuxarı hissəsi bir qədər dik və bir şeyə söykənmiş vəziyyətdə. *Yarımuzanmış halda oxumaq. Yarımuzanmış halda yuxulamaq.*

**YARI-YARI** *zərf* Yarıya bölərək, yarıya bölünmüş halda.

**YARI-YARIMÇI(LI)Q** *zərf* Natamam, yarımçıq. *Könlümə üz tutdum yır-yığış çağı; Baharı yarımçıq, yarı-yarımçıq...* M.Araz.

**YARI-YARIYA** *zərf* Yarısı qədər, əlli faiz. *İstehsal yarı-yarıya artmışdır. – Hələ gələn il dəzgahlar yarı-yarıya artacaqdır.* Mir Cəlal. // Əlli faiz hesabı ilə, yarısı miqdarında.

**YARIYETİŞMİŞ** *sif.* Tam yetişməmiş, bir az yetişmiş.

**YARIYETKİN** *sif.* Tam yetkin olmayan.

**YARIYUXULU** *sif.* Tam ayıq olmayan, mürgüləmə halında olan, yuxulamaq üzrə olan, yaxud hələ tamamilə yuxudan ayılmamış. *Yarıyuxulu gözlər. Yarıyuxulu* (z.) *yatağından qalxmaq. – Qız yarıyuxulu* (z.) *halda təbii bir həvəslə* [Qaraşa] *tərəf qısıldı.* M.İbrahimov.

**YARIYUMŞAQ** *sif.* Azca yumşaq, yaxud oturacağı yumşaq, söykənəcəyi isə bərk olan. *Yarıyumşaq divan. Yarıyumşaq stul.*

**YARIYUMULU** *sif.* Tam yumulu olmayan, azacıq yumulu. *Yarıyumulu göz. – Nadir .. gözünü yarıyumulu* (z.), *yarıaçıq saxlayıb .. Aya tərəf baxmağa başladı.* B.Talıblı.

**YARIZARAFAT** *zərf* Çox ciddi olmayaraq, qismən zarafatla (adətən "yarızarafat, yarıciddi" şəkildə). *Yarızarafat demək. – Mirzağanın yoldaşı yarıciddi, yarızarafat olaraq ona tövsiyə etmişdi...* S.Hüseyn. *Qoşatxan yarızarafat, yarıciddiyyətlə: – Yox, aşna, bax bunu bağışlaya bilməyəcəyik ..* [dedi]. M.İbrahimov. *Tahir yarıciddi, yarızarafat anasının qazancı ilə maraqlandı.* M.Hüseyn.

**YARIZARAFATYANA** bax **yarızarafat**.

**YARLI** *sif.* Yarı, sevgilisi olan. *Gözüm görür, yarlı yarın dindirir; İstərəm ki, səndən kamım alım, yar!* Aşıq Abbas.

**YARLIQ** *is. klas.* Dostluq, yoldaşlıq; məhəbbət, sədaqət. *Əzmi-kuyində könül yarlıq istər bizdən; Əlimizdən nə gəlir xeyri-duadən qeyri.* Füzuli. *İş mənə qalsaydı gər, keçmiş idim badədən; Tale edib yarlıq, qoymadı danayi-eşq.* Q.Zakir.

**YARLIQ** *is.* 1. *tar.* Qızıl Orda xanlarının, özlərinə tabe olan ayrı-ayrı yerlərin idarəsinə aid fərmanı.

2. Malların və ya başqa bir şeyin üstünə yapışdırılan və onların adını, növünü, çəkisini, qiymətini və s.-ni göstərən kağız parçası; etiket. *Malın yarlığı cırılıb.*

3. *məc. dan.* Damğa. *Hər kəsə bir yarlıq vurur.*

**YARLI-YARAQLI** bax **yar-yaraqlı**. *Niftalı koxa .. həmişə biçinçilərə baş çəkməyə gələndə burada uzanıb dincələrdi. İndi də həmişəki kimi elə yarlı-yaraqlı palazın üstünə keçib mütəkkəyə dirsəklənmək istədi.* İ.Şıxlı.

**YARLI-YARAŞIQLI** bax **yar-yaraşıqlı**. *Gözəlin büllur tək gərək bədəni; Eyləyə özünə heyran görəni; Yarlı-yaraşıqlı boyu, gərdəni; Nə uzun, nə gödək, miyanə gərək.* Q.Zakir. *Zahidoğlu qapısındakı cavan katibə qıza da salam verib yarlı-yaraşıqlı kabinetinə girdi.* S.Rəhimov.

**YARLI-YOLDAŞLI** bax **yar-yoldaşlı**.

**YARMA**[1] 1. "Yarmaq"dan *f.is.*

2. *is.* Dingdə döyülmüş dən. *Buğda (arpa) yarması. Bir az yarma çək. – Axşam, lampa işığında Telli əl dəyirmanı ilə yarma çəkirdi.* S.Hüseyn. *Kənd arvadları qışın tədarükünü qurtarırdı: kimisi hazırladığı unu kəndiyə doldurur, kimisi yapmanı kisəyə yığır, kimisi yaman günün köməyi olan kudu və balqabaqları gizlədirdi.* M.İbrahimov. // Yarmadan bişirilmiş sıyıq xörək. *Yarma bişirmək. Bir boşqab südlü yarma.*

**YARMA**[2] *sif.* 1. Yarıq. *Qolu yarma köynək. Yarma cibli şalvar.*

2. Bax **yarmaça** 1-ci mənada. *Yarma odun.*

**YARMAAŞI** *is.* Yarmadan bişirilmiş dəmyə.

**YARMAÇA** *is.* 1. Yarılmış, ikiyə ayrılmış odun parçalarından hər biri. *Yarmaçalardan ocağa qoy. Meşədən bir yük yarmaça gətirdi. – Kamran qucağında odun yarmaçaları içəriyə girdi.* S.Rəhimov.

2. Lülə şəklində olan şey. *Əbil qamçını portfelin üstünə qoyub, saqqız yarmaçasının birini əlinə götürüb hazır dayandı.* Ə.Vəliyev.

**YARMAÇALAMA** "Yarmaçalamaq"dan *f.is.*

**YARMAÇALAMAQ** *f.* İki yerə bölmək, yarmaça halına salmaq; yarmaq, parçalamaq. *Kötüyü yarmaçalamaq.*

**YARMAÇALANMA** "Yarmaçalanmaq"-dan *f.is.*

**YARMAÇALANMAQ** *məch.* Yarmaça halına salınmaq, ikiyə böldürülmək; yardırılmaq, parçaladılmaq.

**YARMAÇALATMA** "Yarmaçalatmaq"dan *f.is.*

**YARMAÇALATMAQ** *icb.* Yardırtmaq, parçalatmaq, yarmaça etdirilmək. *Ağacı yarmaçalatdım ki, tez qurusun.*

**YARMAÇİLOV** *is.* Yarma ilə düyüdən bişirilən çilov. *Yarmaçilova yarmaaşı da deyilir.*

**YARMAQ** *f.* 1. Bir şeyi zərbə ilə vurub ortadan uzununa aralamaq, bölmək, parçalamaq. *Odunu yarmaq. Ağacı yarmaq.* // Şaqqalamaq.

2. Kəsici alətlə və ya başqa bir şeylə qırıb yaralamaq. [Zeynəb acıqlı və ucadan:] *Cəhənnəm olun buradan, yoxsa vallah, bu daşnan vurub başınızı yararam.* C.Məmmədquluzadə. [Xaspolad:] *Sapandımı görmədin? Budur bax, sabah tezdən gedərəm, gözlərəm, bayıra çıxdı, bir böyük daş ataram, baş-gözün yararam.* C.Cabbarlı.

3. Maneəni dəf edərək yol açmaq, yarıb ortasından keçmək. *Gəmi suyu yararaq irəliləyir. – Camaatı yara-yara* (z.) *Kərbəlayı Qubad daxil olur.* Ü.Hacıbəyov. *Dəvəçi qəbiristanlarında cümə axşamlarında olduğu kimi, camaatı yarıb keçmək mümkün deyildi.* M.S.Ordubadi. [Qurban] *qabağında qələbəliyi yarıb keçən arabaları .. süzdü.* A.Şaiq. // Müqaviməti qıraraq irəliləmək, keçmək. *Düşmənin müdafiə xəttini yarmaq. Mühasirəni yarmaq.*

4. Müalicə ya yoxlama və ya başqa məqsədlə bədənin bir yerini kəsmək. *Çibanı yarmaq. Xəstənin qarnını yarmaq. Ölünü yarmaq.*

5. Oğurluq məqsədi ilə bağlı, qapalı bir yeri sındırıb açmaq. *Oğrular dükanı yarıblar*. – [Xortdan:] *..Qərvənd qaydası ilə saxlansa idi, yəqin xanım mənzilini yarmazdılar*. Ə.Haqverdiyev. [Qurban:] *İndi Məhərrəm bəy gəlincə mən min ev yarmışdım*. S.S.Axundov.

**YARMALAMA** "Yarmalamaq"dan *f.is.*

**YARMALAMAQ** *f.* 1. Dəni iri üyütmək, üyüdüb yarma etmək, yarma halına salmaq. *Buğdanı əl dəyirmanında yarmalamaq*.

2. Odunu yarmaq, parçalamaq. *Bu odun düyündür, yarmalanmaz*.

**YARMALANMA** "Yarmalanmaq"dan *f.is.*

**YARMALANMAQ** *məch*. 1. Yarma halına salınmaq, iri üyüdülmək.

2. Doğranmaq, yardırılmaq (odun).

**YARMALATMA** "Yarmalatmaq"dan *f.is.*

**YARMALATMAQ** *icb*. 1. Yarma halına saldırmaq.

2. Doğratmaq, yardırmaq, parçalatmaq.

**YARMALIQ** *sif.* Yarma üçün yarayan, yarma üçün ayrılmış. *Yarmalıq buğda*.

**YÁRMARKA** [*alm.*] İlin müəyyən vaxtlarında və müəyyən yerlərdə vaxtaşırı düzəldilən bazar. *Beynəlxalq yarmarka*. – [Ağa Qurban:] *Keçən il getmişdim Nijni yarmarkasına, .. mal xırıd eyləyib yola saldıqdan sonra bir neçə gün istirahət üçün qalmaq xəyalına düşdüm*. Ə.Haqverdiyev. *Gələn ayın əvvəllərində şəhərimizdə yarmarka başlanır*. Mir Cəlal.

**YARNAQ** *is.* Dağda, qayada, düz yerdə, yaxud ağacda yarıq yer. *Yarnağa su doldu. Yarnağa düşdü*.

**YAROVİZÁSİYA** [*rus.*] *k.t.* Toxumların böyüməsini və yetişməsini sürətləndirmək, məhsuldarlığını artırmaq üçün onların səpindən qabaq xüsusi surətdə işlənməsi (yarovizasiya habelə payızlıq bitkini yazlıq bitkiyə çevirmək imkanı verir). *Buğdanın yarovizasiyası. Kartofun yarovizasiyası. Yarovizasiya etmək*.

**YARPAĞABƏNZƏR** b a x **yarpaqvari**.

**YARPAĞITÜKLÜ** *sif.* Yarpağının üzəri tükcüklərlə örtülmüş bitkilərin ümumi adı.

**YARPAQ** *is.* 1. Ağac və s. bitkilərin yastı və cinslərinə görə müxtəlif şəkildə olan yaşıl rəngli tənəffüs orqanı. *Çinar yarpağı. Qoz yarpağı. Meynə yarpağı. Limon yarpağı. Yarpaqlar payızda tökülür. – Evimiz hazırdır, bir bağ içində; Eyvanı yamyaşıl yarpaq içində*. S.Vurğun. *Ağacların bir yarpağı belə tərpənmirdi*. M.Hüseyn. □ **Yarpaq açmaq** – yarpaqlanmaq, yaşıllaşmaq. *Şəhərin kənarında olan böyük bağçada, hər yerdə olan kimi, ağaclar göyərib yarpaq açmışdı*. C.Cabbarlı. *Pəncərənin önündə bir ağac; Puçurladı, yarpaq açdı*. N.Rəfibəyli. **Yarpaq dolması** – meynə yarpağına bükülüb bişirilən dolma. *..Boşqabın içində üstü qatıqlı dörd yarpaq dolması .. qoyulardı*. H.Sarabski. *Yusif yarpaq dolması ilə dolu boşqabı irəli çəkib yeməyə başladı*. Ə.Vəliyev. **Yarpaq (nanə yarpağı) kimi (tək) əsmək (titrəmək)** – tir-tir əsmək (qorxudan, soyuqdan). *Biçarə münəccimbaşının ərvahı uçub, başladı yarpaq kimi titrəməyə*. M.F.Axundzadə. *Gülsüm qorxusundan nanə yarpağı tək əsirdi*. Ə.Haqverdiyev.

2. Vərəq, səhifə. [Rza kişi] *kağızdan bir yarpaq götürüb içinə çoxlu tənbəki tökdükdən sonra bükdü*. Ə.Vəliyev. // Yarpağa oxşayan, yarpaq şəklində olan hər şey.

3. Bənd (şeirdə). [Rəsul:] *Güloğlan, dörd yarpaq söz deyəcəyəm. Cavabın verə bilsən, mən buradan birbaş Təbrizə qayıdacağam*. "Aşıq Qərib".

**YARPAQBÜKƏN** *is. zool.* Bitkilərin yarpaqlarına ziyan verən cücü.

**YARPAQBÜRÜŞDÜRƏN** b a x **yarpaqbükən**.

**YARPAQCIQ** "Yarpaq"dan *kiç.*

**YARPAQGƏMİRƏN** *is. zool.* Bitkilərin yarpaqlarını və cavan budaqlarını yeyən cücü.

**YARPAQLAMA** "Yarpaqlamaq"dan *f.is.*

**YARPAQLAMAQ** *f.* 1. Göyərərək yarpaq açmaq; yaşıllanmaq. *Ağaclar yarpaqlamışdır. – Bir-iki gündən sonra pambıq yarpaqladı, bitki yuxarı – Günəşə tərəf boylandı, kollar yoğun və güclü oldular*. Ə.Vəliyev.

2. İpəkqurduna yarpaq vermək, yarpaq yedirtmək. *İpəkqurdunu yarpaqlamaq vaxtıdır*.

3. Vərəqləmək. *Kitabı o qədər yarpaqlayıblar ki, cırıq-cırıq olub*.

**YARPAQLANMA** "Yarpaqlanmaq"dan *f.is.*

**YARPAQLANMAQ** 1. *f.* Yavaş-yavaş yarpaqla örtülmək; yaşıllanmaq. *Yaz girəndə ağaclar yarpaqlanmağa başlayır. – Yarpaqlanır ağaclar, yaşıllanır yamaclar*. A.Səhhət. *Çöllər, dağlar, yamaclar zümrüd xalçalarla*

*döşənəcək, çiçəklər açacaq, ağaclar yarpaqlanacaq.* A.Şaiq. *Arxın ağzındakı sahədə eninə-uzununa nizam ilə cərgələnmiş pambıq kolları iki qarışa qədər boy verərək yarpaqlanmışdı.* M.İbrahimov.

2. *məch.* İpəkqurduna yarpaq verilmək, yarpaq yedirilmək.

3. *məch.* Vərəqlənmək.

**YARPAQLI** *sif.* Yarpağı olan, yarpaq açan; yarpaqla örtülü. *Yarpaqlı bitkilər. Yarpaqlı ağ ac. – Sıx yarpaqlı iri palıd ağaclarının tompal kölgələri uzanıb, qaladakı güllü-çiçəkli otların üstünə sərilmişdi.* İ.Şıxlı.

**YARPAQLILIQ** *is.* Yarpaq açmış bitkinin halı; yaşıllıq.

**YARPAQSIZ** *sif.* Yarpağı olmayan, yaşıl olmayan, yaxud yarpağı tökülmüş. *Yarpaqsız ağac. – Budaqsız, yarpaqsız bir söyüd kimi; Yıxılmış torpağa, ağladır məni.* S.Vurğun.

**YARPAQSIZLIQ** *is.* Yarpağı olmama, yarpağı tökülmə.

**YARPAQVARİ** *sif.* Yarpaq şəklində olan, yarpağa oxşayan.

**YARPIZ** *is. bot.* Əksərən su kənarlarında bitən, ağ və qırmızı çiçəkləri olan çox ətirli bitki; çölnanəsi (nanənin bir növü olub şirniyyatda və xörəkdə ədviyyə kimi işlənir). *Yaz ola, dovğa ola, yarpızla; Yay ola, sərin sular sal buzla.* S.Vurğun. *Reyhanlı, yarpızlı şır-şır bulaqlar; Başı ağ çalmalı bu qəlbi dağlar...* B.Vahabzadə.

**YARPIZLIQ** *is.* Çoxlu yarpız bitən yer; yarpız olan yer. *Yarpızlıqdan yarpız dərmək.*

**YARSIZ-YOLDAŞSIZ** *sif.* Dostu, yoldaşı olmayan; tək, kimsəsiz.

**YÁRUS** [*rus.*] 1. Tamaşa salonunda lojaların yerləşdiyi mərtəbələrdən hər biri. *İkinci yarus. Biletim birinci yarusadır.*

2. *geol.* Geoloji dövr ərzində əmələ gəlmiş süxur laylarının məcmusu.

**YAR-YANCAQ** b a x **yancaq**.

**YAR-YARAQ** *top.* Yaraq, silah, əsləhə. *Öz yerində olsun gərək igidin yar-yarağı; Hər gün yeni bir zəfərlə gəlsin onun sorağı.* S.Vurğun.

**YAR-YARAQLI** *sif.* Yarağı, silahı olan; silahlı. *Budur yar-yaraqlı gəlir uzaqdan; Mənim igidlərim.* M.Rahim.

**YAR-YARAŞIQ** b a x **yaraşıq**. [Bəhram:] *O idi məclislər yar-yaraşığı; O idi sarayın parlaq çırağı.* A.Şaiq. *Ataş vəziyyətində İlyasın yar-yaraşığı daha da artırdı.* Mir Cəlal.

**YAR-YARAŞIQLI** b a x **yaraşıqlı**.

**YAR-YOLDAŞ** *top.* Yoldaşlar, dostlar. *Yar-yoldaşın səhərlər; Tez məktəbə gedərlər.* A.Səhhət. *Bir yara-yoldaşa bax! Biz qardaş deyilmiyik?* Ə.Cavad. *Baxıb seyrə daldıq ötən quşları; Dinlədik səsini yar-yoldaşın da.* H.Hüseynzadə.

**YAR-YOLDAŞLI** *sif.* Yarı, yoldaşı, dostları olan (və ya çox olan). *Sən ceyran gözlüsən, çatmaqaşlısan; Tayın-tuşun çoxdur, yar-yoldaşlısan.* N.Rəfibəyli.

**YAS** *is.* [*ər.*] 1. Yaxın bir adamın ölümü münasibətilə (hər cür zövq və əyləncədən imtina etmək və qara geymək şəklində ifadə edilən) hüzn və kədər; matəm. *Yas paltarı* (*qara paltar*). *Yasa getmək. Onlarda yas var. – Yas yiyəsi kiridi, yasa gələn kirimədi.* (Məsəl). *Vaxtını almasın nə toy, nə də yas; Gurlayan səsinlə irəli hayqır!* S.Vurğun. ☐ **Yas qurmaq** – b a x **yas saxlamaq** 1-ci mənada. *İntəhası bir ölüm var ki, orada yas qurub ağlarlar.* C.Məmmədquluzadə. **Yas saxlamaq** – 1) ölən adam üçün matəm məclisi qurub müəyyən adətləri yerinə yetirmək; 2) yasını saxlamaq, yasda olmaq. *Sağsağan atasının ölüm xəbərini gətiribdir, ona görə yas saxlayır.* Ə.Haqverdiyev. **Yas tutmaq** – b a x **yas saxlamaq**. [Xarrat qızından soruşur:] *Bu nə fikrü xəyaldır vəsvəs; Tutmusan hansı bir əzizinə yəs?* S.Ə.Şirvani. **Yas yeri** – yas saxlanılan yer, yas olan ev, ölü yeri. *Hacı Nəsirin başı yas yerinə gələn adamlarla qarışdığından oğlundan xəbərsiz idi.* S.S.Axundov. *Elə bil yas yerinə toplaşmışdılar.* M.Hüseyn. **Yasdan çıxmaq** – matəm müddəti qurtarmaq, yas saxlama müddəti qurtarmaq. *Könlüm yasdan çıxdı, qəlbim qaradan; Gülə-gülə bu həvəsdə, xoş gəldin.* Aşıq Ələsgər. *Bütün şəhər silkinib; Əsər qoymadı pasdan; Dünənki matəm hanı? Doğrudan çıxdı yasdan.* Ə.Cavad. // Hər hansı bir ictimai fəlakət münasibətilə qəbul edilmiş əlamətlərlə ifadə olunan kədər. *Yas günü elan etmək. Yas əlaməti olaraq bayraqları aşağı salmaq.*

2. *məc.* Kədər, yas, ələm; ümidsizlik. *Getdi ol yasəməni zülf, salıb yasə məni; Yasimə bais olub, ah, o səmənbər getdi.* S.Ə.Şirvani. *Bu acı xəbəri axıdan Aras; Axdı həzin-həzin ürəyində yas.* S.Vurğun. ☐ **Yasa batmaq** – çox kədərlənmək, çox qəmlənmək, çox qüssələnmək; üzü gülməmək. *Hadisə mollaya o qədər təsir eləyir ki, kişi əməlli-başlı yasa* batır. "M.N.lətif." *Bənövşə qoxulu yardan ayrılan; Gündə yasa batar, günü zar olur.* M.P.Vaqif.

◊ **Yer altından yasa getmək** – b a x **yer**.

**YASA** *is.* [*türkcə*] Qanun. *Ana yasa* (*konstitusiya*).

**YASAQ** *is.* [*qəd.* yasa – qanun sözündən] 1. Qadağan. *Mən aşığam, yasaq yoxdur diliмə; Şükr edərəm haqdan gələn zülümə.* Aşıq Ələsgər. *Saqi, şərab ilə məni sən tərdəmaq elə; Kimdir baxan bu zahidi-xüşkün yasağına.* S.Ə.Şirvani. ☐ **Yasaq etmək** – qanunən qadağan etmək, mən etmək, icazə verməmək. *Babək yenə orada qaranlıqda, ocaqlardan kənarda yük tayına söykənib dayanmışdı, dönüb çadıra tərəf baxmağı özünə yasaq eləmişdi..* Ə.Məmmədxanlı. // **Yasaqdır** şəklində – qadağandır. *İçəri girmək yasaqdır.*

2. *tar.* Qədimdə Volqaboyu və Sibir xalqlarından alınan vergi; tövcü. // *tar.* Ümumiyyətlə, natural vergi; tövcü. *Xan və qalan feodallar* "*qara camaatdan*" *puldan, baldan və başqa məhsullardan yasaq* (*xərac*) *toplayırdılar.*

**YASAQÇI** *is. köhn.* Keşikçi, qarovulçu.

**YASAQÇILIQ** *is. köhn.* Qarovulçuluq, keşikçilik.

**YASAQLAMA** "Yasaqlamaq"dan *f.is.*

**YASAQLAMAQ** *f.* Yasaq etmək, qadağan etmək.

**YASAQLANMA** "Yasaqlanmaq"dan *f.is.*

**YASAQLANMAQ** *məch.* Yasaq edilmək, qadağan edilmək.

**YASAQLI** *sif.* Yasaq edilmiş, qadağan edilmiş; qadağan.

**YASAQLIQ** *is.* 1. Yasaq olunma, qadağan olunma.

2. B a x **qoruq** 1 və 2-ci mənalarda.

**YASALAQ** *is. məh.* Yasaq yeri; qoruq.

**YASALAMA** "Yasalamaq"dan *f.is.*

**YASALAMAQ** *f. məh.* 1. Əllə hamarlamaq, yastılamaq.

2. *məc.* Üstünü malalamaq. *Rza duruxdu, .. cəsarət etməyib yasalamağa üz qoydu.* Ə.Vəliyev.

**YASAMAL** *is.* Dağın, təpənin üstündə düz yer. *Qoyunları yasamalda otarmaq. – Günəş odlu bir quş kimi üfüqdə sürətlə bir dövrə cızıb qərbdəki yasamal dalına endi.* Ə.Məmmədxanlı.

**YASAVUL** *is. tar.* 1. 1917-ci il inqilabından əvvəl: başlıca olaraq kənd yerlərində polis nəfəri vəzifəsi görən şəxs. *Yüzbaşının yasavulları küçələri dolanırdılar və zərərdidələri yoxlamaqda idilər.* C.Məmmədquluzadə. [Mirzə Kərim:] *Naçalniklərə, pristavlara, yasavullara bel bağlamaq olmaz.* Ə.Haqverdiyev. [Bəy:] *Kişinin dalınca indi də köpək kimi iki yasavul gəzir.* Mir Cəlal. // Qarovulçu, mühafizəçi, qoruqçu, keşikçi. [Hacı Qara:] *Ta bu yasavulların bir neçəsinə toy tutulmasa, ölkə onların əlindən dincəlməz!* M.F.Axundzadə.

2. Kazak ordusunda rotmistr və kapitan çininə uyğun olan zabit rütbəsi.

**YASAVULBAŞI** *is. tar.* Yasavulların böyüyü, baş yasavul (b a x **yasavul** 1-ci mənada). [Camal bəy:] *Cənab yasavulbaşı, buyur görək, o* "*dam*" *haradadır.* N.Vəzirov. *Yasavulbaşı .. yenə dincələ bilmirdi.* M.Rzaquluzadə.

**YASAVULLUQ** *is. tar.* Yasavul vəzifəsi. *Yasavulluq etmək.* // Qarovulçuluq, keşikçilik.

**YASƏMƏN** *is.* [*fars.*] *bot.* Ağ, qırmızı və bənövşəyi rəngdə ətirli salxımvari çiçəklər açan kol. *Yasəmən ağacı. Yasəmən gülü. Ağ yasəmən* (*ağ çiçəkli yasəmən*). – *Lovğa-lovğa baxma mənə; Sar qonanmaz yasəmənə.* "Koroğlu". *Bu gülşənin yasəməni, sünbülü; Nə bir bağə, nə bostanə düşübdür.* M.V.Vidadi. // Bu kolun ağ və ya qırmızı-bənövşəyi gülü. *Yasəmən dəstəsi. Yasəmən qoxusu. Yasəmən ətri. – Gül ilə həmzəban olubdu bülbül; Açılıb bənövşə, yasəmən, sünbül.* Q.Zakir. *Mənə ilham verir o yaşıl çəmən; Üstümə quşbaşı yağan yasəmən.* M.Müşfiq.

**YASƏMƏNİ** *sif.* [*fars.*] Yasəmən rəngində olan, qırmızı-bənövşəyi. // Yasəmən kimi.

*Aşığam yasəməni; Gey, sallan yasəməni; Özü toya, düyünə; Göndərir yasə məni*. Sarı Aşıq.

**YASƏMƏNLİ** *sif.* Tərkibində yasəmən cövhəri olan. *Yasəmənli odekolon* (*sabun*).

**YASƏMƏNLİK** *is.* Yasəmən bitən yer, yasəmən çiçəyi çox olan yer. *Bənövşəlikdə, yasəmənlikdəyəm; Əfşan-əfşan durmuş yaşıl sünbüllər*. A.Səhhət.

**YASXANA** *is.* [*ər.* yəs və *fars.* ...xanə] Yas məclisi, yas olan ev. ☐ **Yasxana qurmaq (açmaq)** – ağlamaq, yas açmaq. *Rizvan Gülpərini tələsdirdi. Oturub yasxana qurmaq vaxtı deyildi.* S.Hüseyn. // *məc.* Məclisdə bikef oturmaq, zarıya-zarıya, qəmgin-qəmgin danışmaq.

**YASİN** *is.* [*ər.*] *din.* Ölü üçün oxunan Quran surələrindən birinin adı. *Doxsan min kəlmədə,* "*Yasin*" *içində; Neçə yerdə müttəsildi* "*dal*" "*dal*"*a?* Aşıq Ələsgər. *Yasini tərsə oxur, çünki boyatdır savadı; Yayılıbdır kişinin hər yerə şöhrətlə adı...* Ə.Vahid.

**YASLAMA** *is. məh.* Xalq adətincə ölü yerinə gətirilən yemək şeyi.

**YASLANMA** "Yaslanmaq"dan *f.is.*

**YASLANMAQ** *f.* 1. Yayılmaq, sərilmək. *Bir gün yeməkdən sonra qoltuqlu sandalyaya yaslanaraq qəzet oxuyarkən Hacı Yunisin xidmətçisi yemək otağına girdi.* A.Şaiq. *Yaslanıb samanın üstünə cansız; Yatır qaqqıltısız, ahsız, amansız.* S.Vurğun.

2. Söykənmək, dayanmaq, sığınmaq. *Gəl, qəhrəman bala, gəl, körpə aslan; Eşqinlə döyünən sinəmə yaslan*. S.Rüstəm. *Onlar da aşiqdi, heyrandı sənə; Yaslanmaq istərdi mavi köksünə*. R.Rza. *Kiçik evlər .. dikdirə yaslanıb sakit-sakit dururdu.* Ə Əbülhəsən.

**YASLATMA** "Yaslatmaq"dan *f.sif.*

**YASLATMAQ** *f.* Sərmək, yıxmaq. *Gülzar baxışlarını yerə sancdı; sanki bütün kainat üzərinə yuvarlanmış, onu yerə yaslatmaq istəyirdi*. C.Cabbarlı.

**YASLI** 1. Yaxın adamının ölümü münasibətilə yas saxlayan, matəm tutan; matəm əlaməti olaraq qara geyinmiş. *Yaslı adam. – Yaslıyam, baş bağlaram; Yuyaram, yaş bağlaram; Tay-tuşunu görəndə; Bağrıma daş bağlaram.* (Bayatı). *Yaslı gəlinlərin, yaslı qızların; Ahından əridi dağların qarı.* S.Vurğun.

2. *məc.* Qəmli, kədərli, ələmli. *Ərməğanım yaslı nəğmə; Bir quş oldum, çıxdım yola*. Ə.Cavad.

**YASLILIQ** *is.* Yaslı, matəmli olma.

**YASLİ** [*rus.*] *dan.* b a x **körpələr evi** ("**körpə**"də). [Cahan:] *Yaşları ötmüş qadınlar üçün gecə məktəbimiz var. Yasli bina etmişik.* Ə.Haqverdiyev.

**YASSAR** *sif.* və *is. məh.* 1. Bacarıqsız, fərasətsiz, əlindən iş gəlməyən, fərsiz. [Zalxa:] *..Hamı heyifsilənirlər ki, Tarverdi necə gözəl oğlandır, heç tayı yoxdur, amma çifayda qorxaqdır, yassardır.* M.F.Axundzadə. [Əbdürrəhman bəy:] *Qorxma yassar, mərdana ol, oturt, Əhməd, gir qoluna, ha... belə.* N.Vəzirov. *Sakit! Qorxaq yassarlar; Silahı qorumayan binamusdur, yassardır.* R.Rza.

2. Çox çirkin.

**YASSARLANMA** "Yassarlanmaq"dan *f.is.*

**YASSARLANMAQ** *f. məh.* 1. İşə yaramaz hala gəlmək; kütləşmək.

2. Çirkinləşmək, pisləşmək.

**YASSARLIQ** *is. məh.* Bacarıqsızlıq, fərasətsizlik, əlindən iş gəlməmə, fərsizlik.

**YASTAN(A)** *is. məh.* Dağda, təpədə, dikdirdə, qayalıqda yastı düz yer. *Alaçığı yastanada qurmaq. – Nəbinin qoyun sürüsü arxacın üst tərəfindəki yastana toplanmışdı.* "Qaçaq Nəbi". *Gülü qızı güllü-çiçəkli bir yastanda dəfn elədik.* Ə.Vəliyev.

**YASTANMAQ** b a x **yaslanmaq**. *Bimar tənində qalmayıb tab; Qılmışdı məzarə yastanıb xab.* Füzuli.

**YASTI** *sif.* 1. Səthi düz, üzərində girintiçıxıntı olmayan. *Yastı tava daşı. Yastı təpə. Yastı yer.* // Yatıq, batıq, basılmış kimi olan. *Yastı döş. Yastı burun.* – [Gülgəzin] *qulaqlarındakı iri, yastı qızıl sırğalar ağacda yarpaq kimi titrəyirdi.* İ.Hüseynov.

2. Çox qalın və ya hündür olmayan; alçaq. *Yastı qutu. – Alçaq, yastı və torpaq evlərdən buranın kiçik bir kənd xarabası olduğu anlaşılırdı.* Ə.Məmmədxanlı. *Bu dağlar yastı dağlar; Qar üstün basdı, dağlar; Üç ay toylu, bayramlı; Doqquz ay yaslı dağlar.* (Bayatı).

**yastı**... – mürəkkəb sözlərin yastılıq mənasında olan birinci tərkib hissəsi; məs.: yastıburun, yastıdilli.

**YASTIAĞIZ** *is.* Tutan tərəfi (ağzı) uzun və yastı olan qısqac (alət).

**YASTIBALABAN** *is.* Balaban növü. *Xanəndə yastıbalabanla oxuyub gecəyə xitam verərdi.* H.Sarabski.

**YASTIBAŞ** *sif.* Başı yastı olan.

**YASTIBIĞ** *sif.* Bığı yastı olan.

**YASTIBURUN** *sif.* Burnu yastı olan. *Balaca, yastıburun Zivər gəlib Kərimin qucağında oturdu.* M.İbrahimov.

**YASTIBUYNUZ** *sif.* Buynuzu yastı olan.

**YASTICA** *sif.* Yastı.

**YASTIDABAN** *sif.* Dabanı hündür olmayan, dabanı yastı olan. *Xəstə Əsgər yenə də Gülöyşəyə nəzər saldı, qapıdan çıxaraq bir ayağına çəkmə, o biri ayağına yastıdaban çust geymiş Əlyara tərəf əyilərək nə isə pıçıldadı.* S.Rəhimov. [Qızın] *ayağında yastıdaban qırmızı tufli vardı.* Ə.Vəliyev.

**YASTIDİB(Lİ)** *sif.* Dibi yastı, düz olan. *Yastıdibli qayıq.*

**YASTIDİMDİKLİLƏR** *cəm zool.* Dimdikləri yastı olan quşlar növü.

**YASTIQ** *is.* 1. Yatanda baş altına qoyulan, içərisi quş tükü, pambıq və ya hava ilə doldurulan dördkünc kisəcik; balış. *Pərqu yastıq. Üz yastığı.* – [Kərbəlayı Fatma xanım:] *..Ay qız, Zeynəb, tez ol, yastıqları gətir, bu tərəfdən qoy.* C.Məmmədquluzadə. *Vədə olunmuş fit səsi Gülsümün qulağına gəldi. Gülsüm cəld başını yastıqdan qalxızıb durdu ayağa..* Ə.Haqverdiyev. *Ev yiyəsinin arvadı yastıq qoydu. Ancaq Cavadın yatmağa vaxtı yox idi.* Ə.Vəliyev. ☐ **Ölüm yastığı** – ölümü gözlənilən xəstənin yatağı, ölüm yatağı. *Ölüm yastığında ümidə bir bax; Elə bil dünyanı tək qurtaracaq.* S.Vurğun.

2. Minikdə, mebeldə, yəhərdə yumşaq oturacaq.

3. *tex.* Maşınların hərlənən və silkələnən hissələri üçün dayaqlıq. // Müxtəlif mexanizmlərdə: təkanın, zərbənin qüvvəsini azaltmaq üçün onların müxtəlif hissələri altına qoyulan hər cür elastik şey. *Top yastığı.* // Arabanın qolu ilə oxu arasına qoyulan ağac. *Araba yastığı.* // Qoşqu heyvanının boynunu sürtməmək üçün boyunduruğun iç tərəfinə bənd edilən yastığa oxşar şey.

◊ **Başının altına yastıq qoymaq** – yalandan söz vermək, vəd etmək, arxayın etmək. *Ayın on birində Sultan da .. qoşunun başının altına yastıq qoymaq qəsdi ilə guya ki qanuniəsasi elanını eləyib.* C.Məmmədquluzadə. **Yastığın yüngül olsun!** – xəstəyə şəfa diləyi. [Adamlar:] *Hacı, yastığın yüngül olsun!..* Qantəmir.

**YASTIQARIN** *is. zool.* Çəkikimilər fəsiləsindən kiçik enli balıq.

**YASTIQCIQ** *is.* Balaca yastıq, kiçik yastıq.

**YASTIQÇA** b a x **yastıqcıq**.

**YASTIQƏLSƏMƏLİ(LƏR)** *cəm zool.* Qığırdaqlı balıqlar yarımsinfi.

**YASTIQLAMA** "Yastıqlamaq"dan *f.is.*

**YASTIQLAMAQ** *f.* 1. Arabanın oxuna yastıq vurmaq, yastıq qayırmaq.

2. *məc.* Qəsdən arxayınçılıq yaratmaq, yuxulatmaq, iğfal etmək.

**YASTIQLATMA** "Yastıqlamaq"dan *f.is.*

**YASTIQLATMAQ** *icb.* Arabanın oxuna yastıq qoydurmaq.

**YASTIQLI** *sif.* Yastığı olan; yumşaq. *Yastıqlı kürsü.*

**YASTIQLIQ** *sif.* Yastıq üçün yararlı.

**YASTIQOTU** *is. bot.* Xaççiçəklilər fəsiləsindən çoxillik, bəzən bir və ya ikiillik ot bitkisi.

**YASTIQÜZÜ** *is.* Yastığa keçirilən örtü, üz. *İpək yastıqüzü.*

**YASTILAMA** "Yastılamaq"dan *f.is.*

**YASTILAMAQ** *f.* Çəkiclə döyməklə, yaxud əzməklə, basmaqla, yaymaqla bir şeyin şəklini düz, yastı hala salmaq; yastılaşdırmaq. *Kündəni yastılamaq. Torpağı, yolu yastılamaq.* – [Rüstəm bəy:] *Yəni dəmiri qızğın ikən yastıla.* S.S.Axundov.

**YASTILANMA** "Yastılanmaq"dan *f.is.*

**YASTILANMAQ** *f.* 1. Yastı hala düşmək; yayılmaq,

2. Yayılmaq, yayılıb oturmaq, naqolay oturmaq. *Salman yastılanaraq kənarda oturmuşdu.* M.İbrahimov.

**YASTILAŞDIRILMA** "Yastılaşdırılmaq"-dan *f.is.*

**YASTILAŞDIRILMAQ** *məch.* Yastı hala salınmaq.

**YASTILAŞDIRMA** "Yastılaşdırmaq"dan *f.is.*

**YASTILAŞDIRMAQ** *f.* Yastı hala salmaq.

**YASTILAŞMA** "Yastılaşmaq"dan *f.is.*

**YASTILAŞMAQ** *f.* Yastı hala düşmək, yastı şəklə düşmək. *Kamilə elə gəldi ki, Zəfərin üzündəki çopur çoxalıb, burnu daha da yastılaşıbdır.* M.Süleymanov.

**YASTILATDIRMA** "Yastılatdırmaq"dan *f.is.*

**YASTILATDIRMAQ** *icb.* Yastı hala saldırmaq.

**YASTILATMA** "Yastılatmaq"dan *f.is.*

**YASTILATMAQ** *f.* 1. B a x **yastılaşdırmaq**.

2. Yatırtmaq. *Pişik qulaqlarını yastıladıb gözlərini qıyaraq başını geri çəkdi*. S.Hüseyn.

**YASTILIQ** *is.* Yastı şeyin halı. *Yerin yastılığı. Daşın yastılığı.*

**YASTISINA** *zərf* Yastı və enli tərəfi üstündə, yastı tərəfi ilə. *Baltanı yastısına vurmaq.*

**YASTISİFƏT** *sif.* Sifəti, üzü yastı olan. *Yastısifət adam.*

**YASTIVARİ** *sif.* Bir qədər yastı.

**YASTIYAPALAQ** *sif.* Pota, kök və yaraşıqsız. [Səfər:] *Bu qız evimizdə şümşad kimi idi. Amma indi gör nə yastıyapalaq olub?* C.Cabbarlı. // Alçaq, yöndəmsiz. *Şirzad yavaş-yavaş addımlayaraq yastıyapalaq kənd evlərinin arasında itdi.* M.İbrahimov.

**YASTIYAPALAQLIQ** *is.* Boyca alçaq və şişman olma; potalıq, yöndəmsizlik. *Bu gün* [Salmanın] *paltarı bədəninin yastıyapalaqlığını bir qədər itirirdi*. M.İbrahimov.

**YASTI-YASTI** *zərf* 1. Aramla, asta-asta, sakit-sakit. ☐ **Yastı-yastı danışmaq** – sözləri uzada-uzada və astadan danışmaq.

2. Yastı (çoxluq bildirir). *Yastı-yastı təpələr yastığıdır çobanın.* (Mahnı).

**YAŞ**[1] *is.* 1. Doğuluş, dünyaya gəlmə günündən keçən vaxt, il; insanın, heyvanın, bitkinin böyüməsində, inkişafında dövr; ömür. *Bir yaşda olan adamlar. Yaşın neçədir? İnəyin üç yaşı var. – Ağıl yaşda deyil, başdadır*. (Ata. sözü). *Nola xəm olsa qəddim, səndən artıqdır mənim yaşım.* Füzuli. [Əsgər:] *Ay xala, bura bax, ağlınca mənim neçə yaşım var?* Ü.Hacıbəyov. ☐ **Yaşa dolmaq** – böyümək, yaşlı olmaq. *İnsan oğlu yarandığı vətənindən kam alar; Ömür gəlib yaşa dolar düz ilqarı görəndə.* S.Vurğun. [Hüseyn] *bu zavallı arvadın nə qədər böyük əzablarla yaşayıb bu yaşa dolduğunu düşünürdü.* S.Rəhman. **Yaşı ötmək** – hər hansı bir yaş həddini ötmək, keçmək. *Yaşı ötdüyünə görə aspiranturaya qəbul olunmadı. Onun əsgərlik yaşı ötmüşdür.* **Yaşı sanı** – ömründəki illər qədər, çoxlu. *Usta yaşı sanı bənna yetişdirmişdir.*

2. Çıxışlıq halda: **yaşından** – anadan olduğu gündən: bütün ömrü boyu, ömründə; heç vaxt. *Heç dərsə baxmayıb sanki yaşından; Fikirlər quş olub uçdu başından.* M.Rahim.

**YAŞ**[2] 1. *sif.* Canına su, rütubət hopmuş; rütubətli, çox nəm, az islaq, sulu (*quru* ziddi). *Yaş paltar. Yaş yer. Yaş qum. Yaş əlləri ilə tutmaq*. // Hələ canında su qalmış, qurumamış. *Yaş səbzə. Yaş meyvə. – Yaş ağaca balta vurmazlar*. (Ata. sözü). [Kərim baba] *iki barmaq qalınlığında yaş çubuğu yonurdu.* A.Şaiq. *Peçdə yanan yaş odunun sızıltısı eşidildi*. M.Hüseyn.

2. *is.* Su, nəm, yaşlıq.

3. *is.* Göz yaşı. *Sözüm yoxdur, fələk gər baxmasa gözdən axan yaşa; Budur qorxum kim, ol seyli-bəla bu körpüdən aşa.* Qövsi. *Hər şey günəşə qurutdu yaşın; Qövsi-qüzeh açdı tər qumaşın.* Xətayi. *Bulaqlar qaynaşır yaş kimi duru; Daşlı küçələri hər zaman quru.* H.K.Sanılı. *Sarxan .. yanaqlarına süzülən iri yaş damlalarını sildi.* M.Hüseyn. ☐ (**Qanlı) yaş axıtmaq (tökmək)** – ağlamaq, acı-acı ağlamaq. *Əjdərin arvadı qanlı yaş tökdü; Xırda uşaqları boynunu bükdü*. H.K.Sanılı. *Məsum kişi özünü saxlaya bilmədi, gözündən parıl-parıl yaş tökdü*. Mir Cəlal. **Yaş boğmaq** – ağlamaq istəmək. *Gülsəhəri yaş boğur, rəng verib rəng alırdı*. Ə.Vəliyev.

4. *sif.* və *is. qəd.* Cavan, gənc, azyaşlı. *Dəmbədəm gər düşsə gözdən dürri-əşkim, vəchi var; Yaş uşaqlardır yetim, onlarda yox rəsmi-ədəb.* Füzuli.

◊ **Qurunun oduna yaş da yanır** – günahsız olaraq cəza çəkənlər haqqında.

**yaş-yaş** *zərf* Yaş halda; qurumamış, qurumadan. *Odunları yaş-yaş ocağa qoymaq. Köynəyi yaş-yaş ütüləmək.*

**YAŞAMA** "Yaşamaq"dan *f.is. Yoxsul şərbaf ailələrinin çoxusunun burda yaşaması təəccüblü deyildi*. Ə.Əbülhəsən.

**YAŞAMAQ** *f.* 1. Həyatda var olmaq, diri olmaq, sağ olmaq. *Babası hələ də yaşayır.* – [Sərvər:] *Çünki mən Gülnazı öldürəndən sonra daha özüm yaşamayacağam.* Ü.Hacıbəyov. // *İs. mənasında.* Həyat, dirilik. *..Tək bircə nəfərin də fikrinə gəlmir ki, dünyada yaşamaq ibarət deyil ondan ki, səhər dükana gedib, axşam abguştu yeyib yatasan.* C.Məmmədquluzadə. *Zəfər! Zəfər! Məncə, bu söz yaşamağın mənasıdır; Tarix deyir ölməmişdir, ölməyəcək qəhrəmanlar.* S.Vurğun. *Bu dünyada yaşamaqdan şirin bir şey ola bilməz.* S.Rəhimov.

2. Ömür sürmək, həyat keçirmək. *Mirzə Qədir bir kübar həyatı yaşayırdı.* S.Hüseyn. *Piri kişi Qaraca qızın kim olduğunu, bu vaxta qədər necə yaşadığını ona ətraflı nağıl edirdi.* S.S.Axundov. // Həyatdan, onun zövq və səfasından faydalanmaq. *Əzizim, yaşamaq lazımdır!*

3. Davam etmək, mövcud olmaq, var olmaq. *Köhnə adətlərin qalıqları hələ də yaşayır.* – *Biz* [kəndlilər və fəhlələr] *əkməsək, biçməsək, onlar da işləməsə, heç bir hökumət yaşaya bilməz.* S.S.Axundov.

4. Bu və ya başqa tərzdə həyat sürmək, dolanmaq, keçinmək, güzəran etmək. *Varlı yaşamaq. Kasıb yaşamaq. Pis yaşamaq. Tək yaşamaq. – Axı bilmirik hara gedəcəyik, necə yaşayacağıq.* M.Hüseyn. // Həyatı, diriliyi, dolanışı üçün vasitə olmaq. *Maaşla yaşamaq. Atasının hesabına yaşamaq. Təqaüdlə yaşamaq.*

5. Bir yerin sakini olmaq, daim və ya müvəqqəti bir yerdə həyat sürmək. *Şəhərdə yaşamaq. Kənddə yaşamaq. Harada yaşamağı məlum deyil. Təzə evdə yaşamaq. Ümumi yataqxanada yaşamaq. Hansı küçədə yaşayırsınız? – Ata-oğul Çənlibeldə yurd saldılar, yaşamağa başladılar.* "Koroğlu". [Orxan:] *Yaşar dağlar başında qartal kimi; Qoşar səhralarda bir maral kimi.* H.Cavid. *Çoxdan bəri yaşadığı balaca daxmanın qarşısındakı hündür yerdə dayanıb şəhərə baxırdı.* M.Hüseyn. // Heyvanlar, quşlar haqqında. *Balıq suda yaşayır. Dəvəquşu Afrikada yaşayır.*

6. Bir yerdə həyat keçirmək, bərabər ömür sürmək. *Elə adamla yaşamaq çətindir.* – [Mirzağa] *ata və anası ilə bir evdə yaşayır, onlarla bərabər yatıb-dururdu.* S.Hüseyn. // Aralarında ər-arvadlıq münasibəti olmaq. *O, arvadı ilə daha yaşamır. – Beləliklə,* [Murad] *sevə bilmədiyi bir qadınla yaşamaq məcburiyyətində idi.* S.Hüseyn.

7. Aralarında qeyri-qanuni, intim əlaqə olmaq.

8. Bir şeyin aludəsi olmaq, bir şeydən ilham almaq, bir şeyi öz həyatı üçün əsas hesab etmək. *Gələcək ümidi ilə yaşamaq. Yoldaşının xatirəsi ilə yaşamaq. O, ancaq elmlə yaşayır. – Sizinlə yaşayır qəlbim indidən; Bizim də başqa bir baharımız var.* S.Vurğun. *Qəhrəman məktəb üçün düşünür, çalışır, onunla yaşayırdı.* S.Rəhimov.

9. Əmr formasında: **yaşa!** – müvəffəqiyyət, uğur arzusu bildirən, yaxud mərhəba! afərin! var ol! mənasında nida.

10. Əmr formasında: **yaşasın!** *tənt.* – var olsun! *Yaşasın bütün dünyada sülh! Yaşasın Vətənimiz!*

**YAŞAR** *sif.* 1. ...yaşında olan, ...yaşı olan (heyvan haqqında). [Əliqulu xanın] *bir ilxısı vardı ki, dünyada olan atların hər rəngindən, hər yaşarından bu ilxıda bir cüt var idi.* "Koroğlu".

2. Çox yaşayan, çox ömür sürən; ölməz.

**YAŞARMA** "Yaşarmaq"dan *f.is.*

**YAŞARMAQ** *f.* 1. İslanmaq, nəmlənmək, yaş olmaq, yaş görünmək.

2. "Gözləri" sözü ilə – yaşla dolmaq, yaş tökmək, ağlamaq istəmək. *Zəhra analarını itirmiş bu üç qızın halını, ürəkparçalayan səmimi göz yaşlarını görərək ixtiyarsız gözləri yaşardı.* S.Hüseyn. *Qəhrəmanın gözləri yaşarmışdı, səsində dərin bir ələm və təəssüf duyulurdu.* H.Nəzərli. // Sulanmaq. *İşıqdan gözləri yaşarmaq.*

**YAŞARTI** *is.* Yaş, gözyaşı, damcı. *..Sübhanverdizadə Rüxsarənin gözündəki yaşartını lampa işığı ilə birləşən parıltısından aydın edə bilirdi.* S.Rəhimov.

**YAŞARTMA** "Yaşartmaq"dan *f.is.*

**YAŞARTMAQ: gözlərini yaşartmaq** – 1) qıcıqlama və ya başqa şeyin təsiri ilə gözlərinin yaşarmasına səbəb olmaq; gözlərini sulandırmaq. *Tüstü adamın gözlərini yaşardır. Çay gözümü yaşartdı.* – ..[Nurəddinlə qulluqçuları Baharın] *bu qayda ilə görüşmələri*

*iki qocanın gözlərini yaşartdı.* S.S.Axundov; 2) ağlamaq. *Yetişdilər kəndə; ucaldı şivən; Yaşartdı gözünü istəyən, sevən.* H.K.Sanılı.

**YAŞATMA** "Yaşatmaq"dan *f.is.*

**YAŞATMAQ** *icb*. Yaşamasına səbəb olmaq, yaşamasına imkan vermək, yaşamasına yardım və kömək etmək. [Elxan:] *..Tanrı olsaydım əgər, gerçəkdən; Ya bu insanları xəlq etməz idim; Əgər etsəm, yaşadardım daim şadü məsud..* H.Cavid. *Məhəbbət! Ömrü sevdasız yaşatmaq bir cinayətdir; Gözəllik! Canlı bir sənət, əzəldən ömrə zinətdir.* S.Vurğun. *Güləcək baharın çiçəklərində; Onu yaşadacaq ürəklərində.* M.Rahim.

**YAŞAYIŞ** *is.* 1. Həyat tərzi, yaşamaq tərzi, həyat şəraiti; dolanacaq, məişət, həyat. *Yaşayışı pis keçmir. Yaşayışı yaxşıdır.* – [Kərim xan və qız] *çiyin-çiyinə verərək həyatın ağır yükünü birlikdə çəkir, öz qarşılıqlı məhəbbət və sədaqətləri ilə ağır yaşayışı yüngülləşdirməyə, şad keçirməyə çalışırdılar.* M.İbrahimov. *Ona elə gəlirdi ki, kənddəki qaynar həyat, gümrahlıq, fərəhli yaşayış da qonaqların ayağı ilə gəlmişdir.* Ə.Vəliyev.

2. Yaşamaq üçün olan, yaşamaq üçün zəruri olan. *Yaşayış məntəqəsi. Yaşayış evi. Yaşayış vasitələri.*

**YAŞID** *is.* və *sif.* Bir başqası ilə bir yaşda olan (adam); həmyaş. *Baxdı, yaşıdları oynayıb-gülür; Üzündən, gözündən sevinc süzülür.* M.Rahim. *Qoşqar öz yaşıdları ilə birgə günlərini bu çayın sağa-sola ayrılıb yenidən birləşən qolları arasında daşlı-qayalı adacıqlarında keçirərdi.* İ.Hüseynov.

**YAŞIDLIQ** *is.* Bir yaşda olma, həmyaş olma; həmyaşlıq.

**YAŞIL** *sif.* 1. Yarpaq, ot rəngində olan. *Yaşıl yarpaq. Yaşıl mahud. Yaşıl boya. – Axşam vaxtları kəndin kənarında durub yaşıl çəmənlərə tamaşa eləyəndə görürsən ki, naxır üz qoyub kəndə gəlməyə.* C.Məmmədquluzadə. [Orxan:] *Ey mavi göylər! Ey yaşıl ormanlar! Ey bacalardan yüksələn dumanlar!* H.Cavid. [Minayə] *..belini çox zəif göstərən yaşıl ipək koftada, başına saldığı ağ torda çox yaraşıqlı görünürdü.* Ə.Əbülhəsən.

2. Kal, yetişməmiş. *Alma hələ yaşıldır.*

3. *is. köhn.* Yaşıl rəngli şey. *Yaşılı sarısından çoxdur.*

**YAŞILBAŞ** *is.* 1. Ördəyin erkəyi. *Tərlan görüb yaşılbaşı; Sağın, qaynaq çala, Maral!* Aşıq Ələsgər. *Yaşılbaşlar qanad çırpar suyuna; Gah durular, gah da dönüb bulanar.* S.Vurğun.

2. Şeirdə adətən gözəl mənasında işlənir. □ **Yaşılbaş sona** – aşıq poeziyasında gözəlin epitetlərindən biri. *Ürkütdü alıcı tərlan; Yaşılbaş sona yeridi.* Aşıq Ələsgər. *Sallanıban kəklik kimi səkəndə; Dönər bir yaşılbaş sonaya Telli.* Aşıq Əbdi.

**YAŞILBAŞLI** *sif.* Başı yaşıl olan. *Yaşılbaşlı ördək.* □ **Yaşılbaşlı sona** – b a x **yaşılbaş sona** ("**yaşılbaş**"da). *Hərgiz olmaz həq gölünün fənası; Əskik olmaz yaşılbaşlı sonası.* M.V.Vidadi. *Teli əyri, yaşılbaşlı sonasan; Gəl bizim göllərdə üz, qadan alım!* Aşıq Ələsgər.

**YAŞILGÖZLÜ** *sif.* Gözlərinin rəngi yaşıl olan. *Yaşılgöz pişik. Yaşılgöz qız.*

**YAŞILIMSOV** *sif.* Yaşıla çalar, yaşıla oxşar rəngdə olan.

**YAŞILIMTIL** b a x **yaşılımsov**.

**YAŞILIMTRAQ** b a x **yaşılımsov**.

**YAŞILLAMA** "Yaşıllamaq"dan *f.is.*

**YAŞILLAMAQ** *f.* Yaşıl rəngə boyamaq, yaşıl etmək.

**YAŞILLANDIRILMA** "Yaşıllandırılmaq"-dan *f.is.*

**YAŞILLANDIRILMAQ** *məch.* 1. Yaşıl rəngə boyadılmaq.

2. B a x **yaşıllaşdırılmaq**.

**YAŞILLANDIRMA** "Yaşıllandırmaq"dan *f.is.*

**YAŞILLANDIRMAQ** *f.* 1. Yaşıl rəngə boyamaq. *Divarı yaşıllandırmaq*.

2. B a x **yaşıllaşdırmaq** 2-ci mənada.

**YAŞILLANMA** "Yaşıllanmaq"dan *f.is.*

**YAŞILLANMAQ** *f.* 1. Yaşıl olmaq, göyərmək, yarpaq açmaq, otla, yarpaqla örtülmək. *Ağaclar yaşıllandı. – Elə çöllər yaşıllanan kimi, arvad səhər yerindən durur və ac yatmış uşaqlarını oyadıb deyir..* C.Məmmədquluzadə.

2. Yaşıla çalmaq, yaşıl görünmək, öz yaşıl rəngi ilə ayrılmaq.

**YAŞILLAŞDIRILMA** "Yaşıllaşdırılmaq"-dan *f.is.*

**YAŞILLAŞDIRILMAQ** *məch*. Ağac, kol və s. bitki əkdirilərək yaşıllıq yaradılmaq. *Məktəbin ətrafı yaşıllaşdırılmışdır.*

**YAŞILLAŞDIRMA** "Yaşıllaşdırmaq"dan *f.is. Yaşıllaşdırma işləri. Şəhəri yaşıllaşdırma həftəsi.*

**YAŞILLAŞDIRMAQ** 1. B a x **yaşıllandırmaq** 1-ci mənada.

2. *f.* Kol və s. göyərti əkməklə yaşıllıq yaratmaq. *Şəhərləri yaşıllaşdırmaq üçün tədbirlər. Küçələri yaşıllaşdırmaq.*

**YAŞILLAŞMA** "Yaşıllaşmaq"dan *f.is.*

**YAŞILLAŞMAQ** b a x **yaşıllanmaq**. *Baharın son ayı idi. Yağışlar yenicə dayanmış, hər yer də yaşıllaşmışdı*. Çəmənzəminli. *Hüseyn tapşırıldı torpaq altına; Yazda yaşıllaşan budaq altına.* M.Rahim. *Yaşıllaşır çöllər, oyanır torpaq; Bəzənir gəlin tək hər dərə, hər dağ.* N.Rəfibəyli.

**YAŞILLATMA** "Yaşıllatmaq"dan *f.is.*

**YAŞILLATMAQ** 1. *icb*. Yaşıl rəngə boyatmaq.

2. B a x **yaşıllaşdırmaq** 2-ci mənada.

**YAŞILLI** *sif.* 1. Yaşıl rəngi və ya yaşıl xalları, cizgiləri və ya çiçəkləri olan. *Yaşıllı, qırmızılı parça*.

2. *məc*. Bəzəkli, qəşəng, gözəl geyimli. *Tərifli gözəllər gəlhagəl oldu; Yaşıllı, zərbaflı, allı sənəm, gəl!* Xəstə Qasım.

**YAŞILLIQ** *is.* 1. Yaşıl şeyin hal və keyfiyyəti. *Rəngin yaşıllığı*.

2. Təzə otlarla örtülü yer, çoxlu göyərti olan yer. *O, gözəl çiçəklərdən, bulaqlardan, yaşıllıqlardan doymaz, ayrılmazdım*. A.Şaiq. *Hər tərəfdən yaşıllıqlar nəzərləri oxşayırdı*. H.Cavid. *Batıqlar, çuxurlar, keçəl təpələr; Burda yaşıllıqdan görünməz əsər*. S.Vurğun.

**YAŞILLIQLAŞMA** "Yaşıllıqlaşmaq"dan *f.is.*

**YAŞILLIQLAŞMAQ** *f.* Yaşıllığa dönmək; yaşıllıq halına gəlmək.

**YAŞIL-MAVİ** *sif.* Yaşıla və maviyə çalan rəngdə olan.

**YAŞIMTIL** b a x **yaşılımtıl**.

**YAŞINDIRMA** "Yaşındırmaq"dan *f.is.*

**YAŞINDIRMAQ** *icb.* Yaşınmağa məcbur etmək.

**YAŞINMA** "Yaşınmaq"dan *f.is.*

**YAŞINMAQ** *qayıd.* Köhnə məişətdə: yad kişilərə görünməmək üçün üzünü örtmək, üzünü bir şeylə örtüb gizlətmək. *Ay üzünü görmək istər, sevdiyim! Söylə görüm, bəs yaşınmaq nədəndir?* Qurbani. *Görəndə Zakiri istər yaşına; Bimürüvvət qoymaz dönüm başına.* Q.Zakir.

**YAŞIÖTMÜŞ** *sif.* Ahıllaşmış, cavanlıq dövrü çoxdan keçmiş. *..Yaşıötmüş bir adamın evlənməsindən ötrü Səmədin bu qədər sevinməsi* [həmyerlisinə] *bir cür gəldi*. İ.Hüseynov.

**YAŞIRMAQ** *f.* Gizlətmək. *Bəndən yüzün yaşırma kim, səcdəgahım oldur*. Nəsimi. *Səni qamışlıqda yaşıran fələk; Əqlini başından çaşıran fələk.* M.V.Vidadi. *Dedim: illərcən görməm visalın; Dedi: bədnəzərdən yaşır camalın*. Aşıq Saleh.

**YAŞLAMA** "Yaşlamaq"dan *f.is.*

**YAŞLAMAQ** Yaş etmək, islatmaq. *Gəldiyev bükdüyü papirosu dili ilə yaşlaya-yaşlaya* (z.) *etinasızlıqla bir də: – Əyləş! – dedi*. Mir Cəlal.

◊ **Boğazını yaşlamaq** – b a x **boğazını islatmaq** ("**boğaz**[1]"da). *Dərviş handan-hana özünə gəldi, bir udum çay aldı, boğazını yaşladı, yenə danışığa başladı.* A.Divanbəyoğlu. *Müdir birdən içəri girdi. Natiq əlini stəkana atdı ki, bir az boğazını yaşlasın.* "Kirpi".

**YAŞLANDIRILMA** "Yaşlandırılmaq"dan *f.is.*

**YAŞLANDIRILMAQ** *məch*. Yaş edilmək, isladılmaq.

**YAŞLANDIRMA** "Yaşlandırmaq"dan *f.is.*

**YAŞLANDIRMAQ** *f.* Yaş etmək, islatmaq.

**YAŞLANMA**[1] "Yaşlanmaq[1]"dan *f.is.*

**YAŞLANMA**[2] "Yaşlanmaq[2]"dan *f.is.*

**YAŞLANMAQ**[1] *f.* Yaşa dolmaq, yaşı çoxalmaq. *Dursun yaşlandıqca əyyaş .. və xudpəsənd bir gənc olaraq yetişirdi.* A.Şaiq. *Doğrudan da, yaşlandıqca Qaraş və Pərşan Rüstəmin ocağına unudulmaz bir sevinc, xoş bir şadlıq gətirmişdi.* M.İbrahimov.

**YAŞLANMAQ**[2] *f.* Yaş olmaq, islanmaq, nəmlənmək.

**YAŞLAŞMA** "Yaşlaşmaq"dan *f.is.*

**YAŞLAŞMAQ** *f.* Tədricən yaş olmaq, islanmaq, su salmaq, nəmlənmək.

**YAŞLATMA** "Yaşlatmaq"dan *f.is.*

**YAŞLATMAQ** *f.* Yaş etmək, islatmaq, nəmlətmək.

**YAŞLI**[1] *sif.* Yaşa dolmuş; sinli, ahıl. *Yaşlı adam. Yaşlı qadın.* // İs. mənasında. *Qoymayın, ay köhnələr, ay yaşlılar; Heyvərələr hər yerə dırmaşdılar!* M.Ə.Sabir. // Cavan

olmayan. [İsrafil] *yaşlı və təcrübəli minicilərlə at qoşaşdırmağı belə bacarırdı.* M.Hüseyn. // ...yaşında olan; yaşı ... olan. *Qırx-qırx beş yaşlı bir kişi.* – [Zeynalın] *qarşısına on bir-on iki yaşlı qara bir qız çıxdı.* S.Hüseyn. *Otuz üç yaşlı Veys birinci dəfə olaraq böyük peşmanlıqla öz-özünü danlayırdı.* Ə.Əbülhəsən. // ...illik, ömrü ... il olan. *Çəpər salmaq üçün 1-2 yaşlı şitillərdən istifadə edilir.*

**YAŞLI**[2] *sif.* Yaşla dolu, yaşarmış. *Baxdı anasının yanıq üzünə; Dağınıq saçına, yaşlı gözünə.* H.K.Sanılı.

...**yaşlı** – yaş miqdarını göstərən mürəkkəb sözlərin ikinci tərkib hissəsi; məs.: beşyaşlı, onyaşlı.

**YAŞLIQ** *is.* 1. Yaş şeyin halı. *Paltarın yaşlığı. Otların yaşlığı.* // Nəmlik rütubətlilik dərəcəsi. *Pambığın yaşlığı hər 19 kiloqrama bir kiloqramdır.*

2. Nəmişlik, yağmurlu və rütubətli hava. *Havada bir yaşlıq var.*

**YAŞLI-QURULU** *sif.* Həm yaşı, həm qurusu olan. *İki dəqiqə çəkmədi ki, kitabxana nərdivanı, sabunlu su ilə dolu vedrə, yaşlı-qurulu silgilər hazır oldu.* Mir Cəlal.

**YAŞMAQ** *is.* 1. Müsəlman qadınlarının yad kişilərdən yaşınmaq üçün üzlərinin adətən gözdən aşağı hissəsini örtdükləri örtü. *Sal ağızdan yaşmaq, şəkkər dəhanın; Şirin-şirin danışmağı görünsün.* Q.Zakir. *Çəkibən yaşmağı, üzünü örtmə; Sinəmin üstünə dağ qoyan dilbər!* Molla Cümə. [Mələk] *məni görüncə dönüb, yaşmağı ağzına çəkib qönçə dəhanın gizlətdi.* A.Divanbəyoğlu. □ **Yaşmaq tutmaq (vurmaq)** – üzünün alt hissəsini yaşmaqla örtmək. *Mən yad bir kişi xeylağı olduğuma görə,* [Nisə xala] *şalın ucunu boynundan dolayıb, ağzına yaşmaq vurmuşdu.* Qantəmir. *Arvadlar bir az geri çəkilmiş, yaşmaq tutmuşdular, cavanların ancaq gözləri güclə görsənirdi.* Ə.Əbülhəsən. // *məc.* Ümumiyyətlə, örtü, pərdə mənasında. *Alov artır, qaranlıq qamçılanır, günəş nazla yaşmağını qaldırır və Rüxsarənin üzünə gülümsəyirdi.* S.Rəhimov.

2. *xüs.* Qapı taylarından birinə və qapı çərçivəsinin alt hissəsinə vurulan nazik uzun taxta parçası.

3. *məc.* Toyuğun cəhənglərində olan tüklər.

**YAŞMAQLAMA** "Yaşmaqlamaq"dan *f.is.*

**YAŞMAQLAMAQ** *f.* 1. Üzünü yaşmaqla örtmək.

2. *xüs.* Qapıya yaşmaq vurmaq.

**YAŞMAQLANMA** "Yaşmaqlanmaq"dan *f.is.*

**YAŞMAQLANMAQ** 1. *qayıd.* Yaşmaqla öz üzünü örtmək.

2. *məch. xüs.* Qapıya yaşmaq vurulmaq.

**YAŞMAQLATMA** "Yaşmaqlatmaq"dan *f.is.*

**YAŞMAQLATMAQ** *icb.* Üzünə yaşmaq tutmaq.

**YAŞMAQLI** *sif.* 1. Üzünə yaşmaq tutmuş. *Yaşmaqlı qarı.* – *Arvad, kişi, oğlan, qız gön çarıqlı, başmaqlı; Gedir qoruq-qaytaqsız, gəlin, qızlar yaşmaqlı.* A.Səhhət. *Çarşablı qızlar, gəlinlər darvazalardan içəri girmir, çarşablarını açmamış, işin yerinə çatmaq üçün o yan-bu yana uşaq qaçırdır*(*dılar*). Ə.Əbülhəsən. *Kənarda dayanıb asta-asta söhbət edən ağzı yaşmaqlı iki arvad Nərgizə baxan kimi dərindən ah çəkdi.* Ə.Vəliyev.

2. Yaşmağı olan. *Yaşmaqlı qapı.*

**YAŞMAQLILIQ** *is.* Yaşmağı olma.

**YAŞMAQSIZLIQ** *is.* Yaşmağı olmama, yaşmaq tutmama, üzüaçıqlıq.

**YAŞMAMA** "Yaşmamaq"dan *f.is.*

**YAŞMAMAQ** b a x **yaşmanmaq**. *Şəhrəbanu xanım ərinin sağ böyründə çənəsini yaşmayıb, ağ örpək başında, həllaci, samit əyləşibdir.* M.F.Axundzadə.

**YAŞMANMA** "Yaşmanmaq"dan *f.is.*

**YAŞMANMAQ** *f.* Kişilərdən gizlənmək məqsədi ilə yaşmaqla üzünü örtmək. *Qarı yaşmanıb: – Allahın əmri ilə, – deyə cavab verdi.* S.Rəhimov.

**YAŞYARIM** *say.* Bir il altı aylıq olan. *Möhsün kişi Qoşqarın anasını hələ Qoşqar yaşyarım olanda boşamışdı.* İ.Hüseynov.

**YAŞYARIMLIQ** *sif.* Bir yaş altı aylıq, on səkkiz aylıq.

**YATA** *zərf k.t.* Hər yerinə yayaraq, hopduraraq. *Əkini yata sulamaq.*

**YATAB** [*rus.* "этап"dan, əsli *fr.*] 1917-ci il inqilabından əvvəlki Rusiyada: silahlı soldatların müşayiəti ilə bir yerdən başqa yerə göndərilən dustaq dəstəsi. *Bildilər yatabdır gələn bu tozda; Əlli nəfər soldat tüfəng omuzda; Almışlar araya yeddi dustağı.* H.K.Sanılı. *Qabağından uzaqdan bir yatab gəldi, keçdi;*

*Bu dəstə xeyli yorğun, çox bitab gəldi, keçdi.* M.Rahim.

**YATACAQ** *is.* 1. B a x **yataq**[1] 1-ci mənada. [Xan] *dodaqlarını gəmirə-gəmirə pəncərənin qabağına yeriyib elə çığırdı ki, xanım yatacaqdan dik atıldı.* Çəmənzəminli. ◻ **Yatacaq otağı** – yataq otağı.

2. Yorğan-döşək, yataq ləvazimatı. *Mən gəlmişəm, Səməd Vahidin kitablarını və yatacağını aparam.* C.Məmmədquluzadə.

**YATAĞAN**[1] *is.* Ucu əyri xəncər. [Xaqanın] *yalnız qurşağındakı altun yatağanı nəzəri cəlb edirdi..* Çəmənzəminli.

**YATAĞAN**[2] *sif.* Yatmağı çox sevən, çox yatan. *Yatağan adam. Yatağan pişik.*

**YATAQ**[1] *is.* 1. Yatmaq üçün yorğan-döşək salınmış yer, yorğan-döşək; ümumiyyətlə, yatmaq üçün yer. *Yataqdan qalxmaq. Yatağına girib yatdı. – Xan səsə yuxudan ayıldı. Əvvəl qulaqlarına inanmayıb durdu, yatağının üstə oturdu.* Çəmənzəminli. *Dustaqlar daş kimi bərk və quru yataqlarında uzanmışdılar.* A.Şaiq. *Ziba yatağına givincə yuxulamışdı.* S.Hüseyn. *Məsum kişi .. havanın tamam qaranlıqlaşdığını görüb yatağını açdı.* Mir Cəlal. ◻ **Yataq otağı** – yatmaq üçün ayrılmış otaq. *O heç bir söz demədən yataq otağına keçdi, ..çarpayıya sərildi və o dəqiqə ağır bir yuxuya getdi.* M.Hüseyn. *Səməd pilləkəni qalxıb dəhlizdən keçəndə açıq qapıdan yataq otağına nəzər saldı.* İ.Hüseynov. **Yatağa düşmək** – ağır xəstələnmək, yorğan-döşəyə düşmək. *Bir kəndli naxoşlayaraq yatağa düşübmüş...* M.İbrahimov. *Anam düşdü yatağa; Döndü solğun yarpağa.* S.Rüstəm. **Yataqda olmaq** – b a x **yatağa düşmək**. *Neçə gündür yataqdadır.* **Yataqdan qalxmaq (durmaq)** – sağalmaq, xəstəlikdən durmaq. // Məc. mənada. *Günəş yatağına doğru endi.*

2. *məc.* Bir şeyin çox olduğu yer; yığınaq, yuva. *Sökülmüş köysümü kim, doludur qəmzən xəyalilə; Həramilər yatağı mənzili-viranə bənzətdim.* Füzuli. *Şəhri-füzəla, diyari-irfan; Mömin yatağı, qədim Şirvan.* M.Ə.Sabir.

3. Payızda, qışda qoyun-quzu, mal-qara saxlanılan yer. *Mal-qaranı çıxardırlar yataqdan; Azan səsi eşidilir uzaqdan.* A.Səhhət. *Qoyun yatağı qamışlığın dalında, çölün ortasında, açıq havada salınmışdı.* M.İbrahimov.

**YATAQ**[2] *is. geol.* Faydalı qazıntı olan yer; mədən. *Daş kömür yataqları. Mədən yatağı. Daşkəsən dəmir filizi yatağı. – Gədəbəydə mis .. və bir çox başqa yataqlar vardır.* M.Qaşqay. *Geoloji əsaslara görə Yenikəndin altında zəngin neft yatağı olduğu güman edilirdi.* M.Süleymanov.

**YATAQ**[3] *is.* Çayın axdığı yer səthində əmələ gətirdiyi çuxur. *Bu çay yatağını daim dəyişir. – Kür oynayır köhlən kimi;Ləngər vurur yatağında.* M.Rahim.

**YATAQ**[4] *is. tex.* Maşınların hərlənən və ya yırğalanan hissələrinin yerləşdiyi dayaq yeri. *Yataqları yağlamaq.*

**YATAQXANA** *is.* 1. Adətən bir müəssisədə işləyən adamların, yaxud bir məktəbdə oxuyan tələbələrin bir yerdə yaşadığı ev. *Fəhlə yataqxanası. Tələbə yataqxanası. Yataqxana növbətçisi. Yataqxanada yaşamaq. – Özü kimi iri bir oğlanın rayon mərkəzindəki ümumi yataqxanada müftə yeyib-içib yaşaması nədənsə* [Fərmana] *ağır gəlirdi.* Ə.Sadıq.

2. Yataq otağı.

**YATAQLI**[1] *sif.* Yatağı, yatmaq üçün yeri olan. *Yataqlı vaqon.*

**YATAQLI**[2] *sif.* Yatağı, məcrası (dərin) olan. *Yataqlı çay.*

**YATALAQ** *is. tib.* Çox yoluxucu bir neçə xəstəliyin ümumi adı; tif. *Qarın yatalağı. Səpmə yatalaq. Qayıdan yatalaq.* – [Gülcahan:] *..Mirzədadaş bu gün üç gündür yatalaq yatır..* N.Vəzirov. [Əntiqənin] *atası qarışıqlıq illərində yatalaqdan ölmüşdü.* Mir Cəlal. *Feldşerin deməsindən bəlli oldu ki, Qəhrəman yatalaq xəstəliyinə tutulubdur.* Ə.Vəliyev.

**YATALAQLI** *sif.* Yatalaq xəstəliyinə tutulmuş. *Yatalaqlı xəstələr.*

**YATALQA** *is.* Düşərgə, yataq; müvəqqəti yaşayış yeri. [İvan bəy:] *Sənin evin olub qaçaqlar yatalqası.* N.Vəzirov.

**YATAR**[1] *is.* 1. Yatmaq, əyilmək səmti, bir şeyin aşağı yatmış tərəfi. *..Danışan gənc mühəndis uzunsov başının ortadan ayrılmış saçlarını yatarına* (z.) *sığallayaraq, bütün günahı neft sənayesinə təzə gəlmiş cavanlarda görürdü.* M.Hüseyn.

2. *məh.* Gecə yatmaq çağı, yatmağa yaxın. *Yatar qarına yumurta yemə.*

**YATAR**[2] b a x **yatır**.

**YATIXMA** "Yatıxmaq"dan *f.is.*

**YATIXMAQ** *f.* Lay-lay yastılaşaraq çökmək; yatmaq. *Torpağın yatıxıb yerə çökməsi.*

**YATIQ** *sif.* 1. Əyilmiş, yastılanmış, yatmış, çökmüş, basılmış kimi olan. *Köksü yatıq. Beli yatıqdır. Samovarın böyrü yatıqdır.*

2. *məc.* Heç bir şeydən xəbəri olmayan, ayıq olmayan; xəbərsiz, fərasətsiz. [Mahmud] *ən yatıq adamı belə şübhələndirə bilərdi.* Ə.Əbülhəsən.

**YATIQLIQ** *is.* Yatıq şeyin halı.

**YATILI** *zərf* Yatmış halda, yuxulu halda, yuxulu-yuxulu. *Axırda onu yatılı halda götürüb evə gətirdilər.* "Aşıq Qərib".

**YATIM[1]** *is.* Bir şeyin yatmaq, əyilmək səmti, qaydası, üsulu; yatmış, əyilmiş şeyin halı. *Saçın yatımı.* // Xov. *Xalçanın yatımı.*

**YATIM[2]** *is. geol.* Mədən yatağının forması, quruluşu.

**YATIMINA** *zərf* Yastı və enli tərəfi üstündə; yastısına.

**YATIMLI** *sif.* 1. Yaxşı, asan yatırıla bilən, qoyula bilən, yerləşdirilə bilən.

2. *məc.* Xoşagələn, ürəyəyatan, sevimli. *Xüsusən çalanın ürəyə yatımlı səsi, oxunan bayatıdakı mənanın kəskinliyi, sazın uyğun səsinə qarışdığı zaman, insan özünü büsbütün başqa bir aləmdə hiss edirdi.* A.Şaiq.

**YATIMLILIQ** *is.* 1. Yatımlı şeyin halı.

2. Xoşa gəlmə, ürəyə yatma.

**YATIR** *is.* 1. Toxunulmayıb saxlanılan dəyərli, qiymətli şeylər; qızıl-gümüş, var-dövlət. [Cavanşir bəy:] *Kişinin gərək qiymətdə ağır, çəkidə yüngül yatırı olsun.* S.Rəhimov.

2. Qənaət edilib yığılmış, saxlanmış pul və s.

**YATIRDILMA** "Yatırdılmaq"dan *f.is.*

**YATIRDILMAQ** *məch.* Yatmağa məcbur edilmək; yatızdırılmaq.

**YATIRILMA** "Yatırılmaq"dan *f.is. Üsyanın yatırılması. Uşağın yatırılması uzun çəkdi.*

**YATIRILMAQ** *məch.* 1. Yatmağa məcbur edilmək.

2. Zorakı yolla bir şeyə nəhayət verilmək, silah gücü ilə dayandırılmaq. *İğtişaş yatırıldı.*

**YATIRIM** *is.* Qənaət edilib yığılmış xəzinə.

**YATIRMA** "Yatırmaq"dan *f.is.*

**YATIRMAQ** *f.* 1. Yuxuya vermək, yatmağa vadar etmək, yatağa qoymaq, uyutmaq, yuxulatmağa çalışmaq. *Uşağı yatırmaq. – Zeynal qapı ağzına gəldi, arvadı Mehriban, dörd ayını hələ bitirməmiş körpə Xalidəsini yatırırdı.* S.Hüseyn. *Böyük qız lap kiçiyi yatırıb ortancılla oynayırdı.* Ə.Vəliyev.

2. *məc.* Zorakı yolla nəhayət vermək, silah gücü ilə dayandırmaq, susdurmaq, boğmaq. *Üsyanı yatırmaq.* // *məc.* Sakitləşdirmək, yavaşıtmaq, təsirini, gücünü azaltmaq, şiddətləndirməyə, gücləndirməyə, yayılmağa qoymamaq. *Təbrizlilərin həyəcanını yatırtmaq üçün Hacı Səməd xan mollaları və müctəhidləri səfərbər etdi..* M.S.Ordubadi.

3. Aşağı əymək, aşağı sallamaq, səmtinə görə əymək. *Ağacın budağını bir qədər yatırmaq.*

4. İşini, hərəkətini dayandırmaq. *..Üyüdülməyə toplanan taxıl bitdiyindən* [Murad] *motoru yatırıb dışarı çıxdı.* S.Hüseyn.

**YATIRTMA** "Yatırtmaq"dan *f.is.*

**YATIRTMAQ** *icb.* 1. Yuxuya vermək, yatmağa məcbur etmək. *Xavər bütün günü ağzına çörək dəyməmiş Azadı dilə tutaraq təzəcə yatırtmışdı.* M.İbrahimov.

2. Aşağı əymək, aşağı sallamaq, səmtinə görə əymək, yatıq hala salmaq. *Meynəni pəncərə tərəfə yatırdın! – Şiraslan .. üzüyuxarı, qabaran saçlarını, bir anlığa da olsa, dala yatırtdı.* S.Rəhimov.

3. *məc.* Sakit etmək, hirsini soyutmaq, həyəcanını azaltmaq. [Südabənin anası:] *..Axırda hər yandan qarğa-quzğun kimi dövlətlilər töküləb şeyxi yatırtdılar.* M.İbrahimov.

4. Təsirini azaltmaq. *Çay insanın susuzluğunu yaxşı yatırdır.*

5. Fəaliyyətini, işini dayandırmaq; bağlamaq. *Min doqquz yüz beşinci ilin yanvar ayında qəzetənin təzə il üçün abunəsi hər yandan şirin gəldiyi bir vaxtda Məhəmmədağa qəzetəni yatırtdı və başladı Bakıya köçməyə hazırlaşmağa.* C.Məmmədquluzadə.

**YATIŞ** *is.* Yatmaq, uzanmaq tərzi; yatma. *Aslan yatışından da bəllidir.* (Ata. sözü). [Azadın yoldaşlarının] *belə sakit yatışı onun kədərlərini silib, qəlbinə bir az təsəlli verdi.* A.Şaiq.

**YATIŞMA** "Yatışmaq"dan *f.is.*

**YATIŞMAQ** *qarş.* 1. Hamı birlikdə uzanıb yatmaq, hərə öz yerində uzanıb yatmaq. *Çaydan sonra yatışdıq.* C.Məmmədquluzadə. *Gecədir. Yatışır dustaqlar tamam.* H.K.Sanılı.

*Uşaqlar köhnə yorğanın altına doluşub, nə barədə isə xosunlaşandan sonra, daş kimi ağır düşüb yatışdılar*. M.Hüseyn.

2. Hamı, çox adam birlikdə aşağı yatmaq; uzanmaq. *Mehdi öz dəstəsi ilə yaxınlaşıb səngərlərə yatışırlar*. "Qaçaq Nəbi".

3. *məc*. Yatmaq, sükuta dalmaq, səs-küy kəsilmək, sakitləşmək, sayxaşmaq. *Kənd yatışandan sonra Sayalının dizinə kaftar qüvvəti gəlirdi*. Mir Cəlal.

**YATIZDIRILMA** "Yatızdırılmaq"dan *f.is.*

**YATIZDIRILMAQ** b a x **yatırdılmaq**.

**YATIZDIRMA** "Yatızdırmaq"dan *f.is.*

**YATIZDIRMAQ** b a x **yatırtmaq**.

**YATQIN** *sif.* Əyilmiş, yatırdılmış, yatıq, yatmış.

**YATQINLIQ** *is.* Yatmış şeyin halı.

**YATMA** "Yatmaq"dan *f.is. Uşağın başını* [Səriyyə xalanın] *dizi üstə qoyması ilə yatması bir oldu*. M.İbrahimov.

**YATMAQ** *f.* 1. Yuxu halında olmaq; yuxulamaq. *Bərk yatmaq. Uzanıb yatmaq. Yatıb dincini almaq. Yatdığı yerdə* (*yorğan-döşəkdə, yuxuda olduğu zaman*). *– Gecəni yatdıq ki, səhər duraq, Məşədi Qulamhüseyn ilə bahəm Naxçıvana gedək.* C.Məmmədquluzadə. *Xüsusən ev qulluqçuları, gədə, Almaz və qulluqçu qız Pəri o gecə səhərə kimi yatmamışdılar.* N.Nərimanov. ☐ **Yatıb qalmaq** – vaxtında ayılmamaq. **Yatıb durmamaq** – ölmək. // *məc.* Əbədi istirahətgahda olmaq, dəfn olunmaq. *Qəbirdə yatanlar* (*ölülər*). *Bu qəbirdə kim yatır?* // Yuxulamaq üçün yatağa girmək. *Saat neçədə yatırsınız? O, çox tez yatır. – Mirzə iştahasız nahar yeyib yatmaq istədi, hərçi çalışdı, yuxusu gəlmədi.* Ə.Haqverdiyev. // Uzanmaq, uzanmış vəziyyət almaq. *Tutdular bərəni, eyləməyib ləng; Yatdılar səngərə o iki pələng*. H.K.Sanılı. // Gecəni keçirmək. *Gecəni harada yatırdınız?*

2. Xəstə olmaq, xəstələnmək, azarlamaq, yorğan-döşəyə düşmək (bəzən "xəstə" sözü ilə). *Düz iki ay yatdım. Çoxdandır yatır. – Bir aya qədər Rəştdə xəstə yatdım.* S.Hüseyn. *Nəhayət, Almaz xeyli sozaldı, bir gün durdu, o biri gün yatdı, axırıncı dəfə yıxıldığı yerindən qalxmadı.* S.Rəhimov. *Şərəf ölümcül halda hospitalda yatırkən döyüşdən göz açmayan Rüstəm onu unuda bilmirdi*. M.İbrahimov.

3. Uçulmaq, düşmək, süqut etmək, dağılmaq. *Toplar guruldadı, saraylar yatdı; Bunları insanın əli yaratdı*. S.Vurğun. // Çökmək, enmək. *Suyun bulanlıq olmağına səbəb onun içində üzən xırda torpaqdır. Belə saxlanan zaman onlar suyun dibinə yatdığına görə su durulur*. H.Zərdabi. *Maşın düşərgəyə doğru irəlilədikcə təkərin altından çıxan toz bulud kimi qalxıb otların üstünə yatırdı.* M.İbrahimov.

4. Bir işin, hadisənin təsiri azalmaq, zəifləmək, sakitləşmək, dayanmaq, qurtarmaq. *Külək yatdı. İstilər bir az yatdı. Hirsi yatdı. Ehtiraslar yatdı. – Yaz gəldi, bahar oldu, qışın şiddəti getdi; Qar bitdi, külək yatdı, soyuq axıra yetdi.* A.Səhhət. [Çiçək xanım:] *A Fatma xanım, dincəldinmi? Nasın-pasın yatdımı?* N.Vəzirov. *Dava təzə şey deyil. Mən bu altmış yaşımda davanın yatdığını görməmişəm.* Mir Cəlal.

5. *məc*. Qəflət etmək, qəflətdə olmaq, arxayın olmaq, xəbərsiz olmaq, heç bir hərəkət göstərməmək. *Yatmaq vaxtı deyil! Yatanları oyatmaq* (*qəflətdə olanları ayıltmaq*). *Yatmısan, heç nədən xəbərin yoxdur. – İndi isbatihünər, sidqü sədaqət vaxtıdır! Yatmayın, huşyar olun, iş vaxtı, qeyrət vaxtıdır!* M.Ə.Sabir. *..Qorxuram İranın hürriyyətinə ümidvar olub yenə yatasınız.* C.Məmmədquluzadə.

6. *məc.* Dayanmaq, işləməmək, fəaliyyətdən qalmaq. *İş yatıb qalıb. – Qəzetənin həmişəlik yatmağı bu qərar ilə əmələ gəldi.* C.Məmmədquluzadə. *Qış-yay elə bir gün olmamışdır ki, Musanın dəyirmanı yatsın*. İ.Əfəndiyev.

7. Keyimək, uyuşmaq, yuxulamaq. *Ayaqlarım yatıb.*

8. Yığılıb qalmaq, işə getməmək, satılmamaq (bu mənada adətən "yatıb-qalmaq" şəklində işlənir). *Dükanlarda mal yatıb qalıb.*

9. Həbsxanada olmaq, həbsdə olmaq, məhbus (dustaq) olmaq. *Hərif neçə il yatıb?* – [Müəllim] *zənn etdi ki, Tellinin əri ölmüşdür və ya bir cinayət yapmış da, həbsxanada yatır.* S.Hüseyn.

10. Bir sıra sözlərə qoşularaq müxtəlif ifadələr düzəldilir; məs.: ürəyinə yatmaq, könlünə yatmaq, ağlına yatmaq, dilinə yatmaq.

**YATMALI** *sif.* Yatmaq üçün çox əlverişli, yararlı, münasib, rahat. *Əcəb yatmalı yerdir.*

**YATMIŞ** *f.sif.* Yuxuda olan; yuxulu. *Yatmış uşaq.* // İs. mənasında. *Yatmışları razı deyiləm kimsə oyatsın.* M.Ə.Sabir. *Gün .. yavaş-yavaş qalxıb dağın dalından göründü və ruh verən qızıl zərrələrini aləmə dağıdıb, bütün yatmışları oyatdı.* S.S.Axundov.

**YATMIŞLIQ**: **özünü yatmışlığa qoymaq** – özünü yatmış, yuxulu kimi göstərmək, özünü yuxuluğa vurmaq. [Məsmə] *yorğun olduğu üçün özünü yatmışlığa qoyur, cavab verməyir.* S.Hüseyn.

**YAVA** *sif.* 1. Pis, xarab, ədəbsiz, həyasız. ☐ **Yava danışmaq (söyləmək)** – pis-pis danışmaq, ədəbsiz danışmaq, söyüş söymək. [Hacı Kərim:] *Bu nə qələt edir, nə yava danışır. Səni kim bu məclisə çağırdı?* M.F.Axundzadə. [Allahqulu:] *Nə yava söyləyirsən, ay gədə!* N.Vəzirov.

2. *vulq.* Əxlaqsız, pozğun (bəzən söyüş mənasında).

3. Yersiz-yurdsuz, avara.

**YAVALAMA** "Yavalamaq"dan *f.is.*

**YAVALAMAQ** *f. məh.* Pisləmək, xarablamaq.

**YAVALANMA** "Yavalanmaq"dan *f.is.*

**YAVALANMAQ** *məch. məh.* Xarab olmaq, korşalmaq, kəsərdən düşmək. *Meydanda, yaman yerdə qılıncım yavalandı; Başdan yaralandım, dedim Allaha təvəkkül.* Ə.Nəzmi.

**YAVALAŞMA** "Yavalaşmaq"dan *f.is.*

**YAVALAŞMAQ** *f. dan.* 1. Pisləşmək, xarablaşmaq.

2. Həyasızlaşmaq, sırtılmaq.

**YAVALIQ** *is.* Pislik, heyvərəlik, ədəbsizlik. [Sirat] *bəyin ağzının yavalığına bələd idi.* Ə.Əbülhəsən.

**YAVAN** *sif.* 1. Təkcə çörəkdən ibarət olan; yavanlığı olmayan. *Yavan çörək yedi. – Adamın öz yavan çörəyi özgənin plovundan yaxşıdır.* (Ata. sözü). [Surxay:] *Al, on üç qəpik, yenə yavan çörək alıb yeyə bilərsən, səni zavoda götürüblər?* S.Rəhman. // *Zərf mənasında.* Yavanlıqsız. *Çörəyi yavan yemək.*

2. Yağlı olmayan, yağsız. *Yavan ət.* – [Mahmud:] *Suyu asdım, di buyur, yenə yavan şorbanı bişir.* Ə.Haqverdiyev.

3. *məh.* Boş, mənasız, şit, duzsuz. *Yavan söz. – Sanki Əzizin yavan və duzsuz söhbətinə şəkər qatdılar.* Ə.Vəliyev.

4. *k.t. məh.* Qidalı maddələrdən məhrum (torpaq haqqında). [Miçurin] *qəti olaraq öz tingliyini başqa bir yerə – yavan, qumsal torpağı olan səhraya köçürməyi qərara aldı.* M.Axundov.

**YAVANA** *zərf* Yavan. [Məşədi İbad:] *Çörəyi yemərəm mən yavana; Yaxşı demərəm mən yamana.* Ü.Hacıbəyov.

**YAVANLIQ** *is.* Çörəklə yeyilən hər şey. *İmanın satıb əppəyinə yavanlıq eləyib.* (Ata. sözü). [Pirverdi:] *Srağagün sabah vaxtı .. evdən çıxıb oğlanlarıma .. yavanlıq aparırdım.* N.Vəzirov. *Körpənin adını Qərib qoydunuz; Yediyi arpadır, yavanlığı duz.* S.Vurğun.

**YAVANLIQSIZ** 1. *sif.* Yavanlığı olmayan. *Yavanlıqsız çörək.*

2. *zərf* Yavanlıq olmadan. *Yavanlıqsız qalmaq.*

**YAVANSIZLIQ** *is.* Yavanlığın olmadığı hal.

**YAVAN-YAVAN** *zərf* Yavanlıq olmadan, yavanlıqsız. *Tərlan doğranmış çörəkdən bir parça götürüb yavan-yavan gəvələməyə başladı.* M.Hüseyn.

**YAVAŞ** *zərf* 1. Hərəkəti asta, zəif, ağır. *Yavaş yerimək.* // Sif. mənasında. *Qız .. yavaş addımlarla onu izləyir.* M.Hüseyn.

2. Sakit, asta, qışqırıqsız, səssiz. *Yavaş danış!*

3. *sif.* Sakit, mülayim, həlim. *Yavaş inək. Yavaş uşaq.*

**yavaş-yavaş** *zərf* Asta-asta, zəif-zəif, sakit-sakit. *Yavaş-yavaş yerimək. Yavaş-yavaş danış, tələsmə. – Batdı yavaş-yavaş Hacının səsi; Kəsildi axırda, bayquş nəfəsi.* H.K.Sanılı. *Yavaş-yavaş pilləkənləri endik.* Mir Cəlal. // Azca-azca, ağır-ağır, tədriclə, aramla. *Xəstə yavaş-yavaş özünə gəlir. Qarlar yavaş-yavaş əriyir. İşlə yavaş-yavaş tanış olur. – Axşam yavaş-yavaş araya gəldi. Gün qüruba yaxınlaşdı.* N.Nərimanov. [Hacı Sultan] *yavaş-yavaş alver edib çörək pulusunu qazanırdı.* S.Hüseyn. *Əvvəlcə qayığa minməkdən qorxan Tofiq yavaş-yavaş öyrəşmişdi.* M.Rzaquluzadə. *Kabab yavaş-yavaş sulanır bu an; Ağ lavaş qoyulub yaşıl süfrəyə.* H.Hüseynzadə.

**YAVAŞAN** *is. məh.* b a x **yovşan**. *Xırdaca-xırdaca çəpişlər; Yavaşanın başın dişlər.* (Sayaçı sözü).

**YAVAŞCA** *zərf* Astaca, üsulluca, yavaşcadan, hiss etdirmədən, səs çıxarmadan, bildirmədən. *Yavaşca yerindən durdu. Yavaşca kənara çəkildi. – Axırda zəiflər yavaşca başlayırlar əkilməyə və güclülər, yəni dəstə sahibləri qalırlar məclisdə.* C.Məmmədquluzadə. *Zeynal yavaşca addımları ilə Mehribana yaxınlaşdı.* S.Hüseyn. *..Qoşqar yavaşca qalxıb dinməz-söyləməz kabineti tərk edəndə Sultan elə bil yuxudan ayıldı.* İ.Hüseynov. // Başqalarına eşitdirmədən, astadan, yavaş səslə. *Qulluqçu .. sözünün axırını yavaşcadan söyləyərək, qızarmış bir halda otaqdan çıxdı.* Çəmənzəminli. *Ana Südabəyə yavaşca: – Qızım, Firidunu qonaq çağırsana, – dedi.* M.İbrahimov.

**YAVAŞCADAN** b a x **yavaşca**. [Məmmədcəfər] *əyilib yavaşcadan qulağıma pıçıldadı.* Qantəmir. *Yenə əvvəlki gecələr kimi* [müəllim və Telli] *yavaşcadan söhbətə başlamışlardı.* S.Hüseyn. *Əzizin dizləri titrədi, yavaşcadan çamadanının üstündə oturdu.* S.Rəhman.

**YAVAŞCALIQLA** *zərf dan.* Yavaş, yavaşca. *Çoban yavaşcalıqnan əyilib Aşıq Şirvandan xəbər aldı.* "Abbas və Gülgəz".

**YAVAŞCANA** *dan.* b a x **yavaşca**.

**YAVAŞDAN** *zərf* b a x **yavaşca**. *Qoca kapitan qəmgin səslə yavaşdan dilləndi.* M.Süleymanov.

**YAVAŞIDICI** *sif.* və *is. tex.* Sürəti, hərəkəti yavaşıdan, azaldan (cihaz və s.).

**YAVAŞIMA** "Yavaşımaq"dan *f.is.*

**YAVAŞIMAQ** *f.* Bir şeyin hərəkətinin, sürətinin, şiddətinin, təsirinin və s.-nin gücü getdikcə azalmaq, zəifləşmək, ağırlaşmaq, sakitləşmək. *Külək yavaşımağa başladı. Sel yavaşıdı. Maşının hərəkəti yavaşıdı. Ağrı yavaşıdı. – Mehribanın hıçqırıqları yavaşımağa başlayınca Səlim onun tərləmiş üzünə tökülmüş pərişan saçlarını bir tərəfə edib alnının tərini sildi.* S.Hüseyn. *Budur, zurna yavaşıdı.* Çəmənzəminli.

**YAVAŞITMA** "Yavaşıtmaq"dan *f.is.*

**YAVAŞITMAQ** *icb.* Hərəkətin sürətini azaltmaq, astalaşdırmaq, zəiflətmək, alçaltmaq. *Addımını yavaşıtmaq. – Xanım bir yerdə durdumu, Həmzə bəy də yerişini yavaşıdıb gözlərini ondan çəkmirdi.* Çəmənzəminli. *Bəbir bəy səsini yavaşıtdı.* Mir Cəlal. *Tapdıq ağlamasını yavaşıtdı.* Ə.Vəliyev.

**YAVAŞLAMA** "Yavaşlamaq"dan *f.is.*

**YAVAŞLAMAQ** *f.* Yerişini, sürətini azaltmaq, yavaş etmək. *Məşədi Əsgər bir az yavaşlayıb özünü bir qaranlıq yerə çatdırdı.* S.M.Qənizadə.

**YAVAŞLANDIRICI** b a x **yavaşıdıcı**.

**YAVAŞLANDIRMA** "Yavaşlandırmaq"dan *f.is.*

**YAVAŞLANDIRMAQ** *icb.* Yavaş etmək, yavaşıtmaq, ağırlaşdırmaq, azaltmaq.

**YAVAŞLANMA** "Yavaşlanmaq"dan *f.is.*

**YAVAŞLANMAQ** *f.* Yavaş olmaq, yavaşımaq, ağırlaşmaq, azalmaq, zəifləşmək.

**YAVAŞLATMA** "Yavaşlatmaq"dan *f.is.*

**YAVAŞLATMAQ** *icb.* Yavaş etməyə, azaltmağa, zəifləşdirməyə, yavaşıtmağa məcbur etmək. *Külək Dilbərin üzünə çırpır, qulaqlarında uğuldayır, yerişini yavaşladırdı.* C.Cabbarlı.

**YAVAŞLIQ** *is.* Hərəkətdə, sürətdə astalıq. *Bir-iki yolçu da bu yavaşlıqdan istifadə edərək tramvaydan atılıb çıxdı.* Qantəmir.

**YAVA-YAVA** *zərf dan.* Hərzə-hərzə, ağzına nə gəldi, həyasız-həyasız, ədəbsizcəsinə, tərbiyəsizcəsinə. *Yava-yava danışmaq.* – [Hacı Qara:] *Yava-yava danışma, yoldan çox adam gedir, doğrusun de görüm, kimsiniz?* M.F.Axundzadə. [Sultan bəy Əsgərə:] *Nə yava-yava danışırsan?* Ü.Hacıbəyov. [Sultan:] *Bura sizə rəiyyət Vəlməmmədin evi deyildir ki, .. yava-yava hırıldaşırsınız.* S.Rəhimov.

**YAVƏR** *is.* [*fars.*] 1. *klas.* Yardımçı, köməkçi, imdada çatan. *Anadan yaxşı yavər olmaz.* (Ata. sözü). *Təklif nə hacətdi, gözüm, vaqifi-halə; Dildadələrin dadrəsi, yavəri sənsən.* Q.Zakir. *Bikəsəm aləmara dərdü qəmimdən özgə; Nə həvadarü nə yavər, nə kəsim var mənim.* S.Ə.Şirvani.

2. *hərb.* Yuxarı rütbəli zabitlərin yanında xidməti tapşırıqları və ya qərargah işlərini yerinə yetirən kiçik rütbəli, hərbi vəzifəli şəxs. *..Nazirin hərbi geyimli yavəri içəri girdi.* S.Rəhimov.

**YAVƏRLİK** *is.* Yavərin gördüyü iş, vəzifə.

**YAVINC** *is. məh.* Tabeçilik, tabe olan.

**YAVRU** *is.* Çocuq, uşaq, körpə, bala (nəvazişlə deyilir). *Yavrum, quzum! Yatanlar ayılmaz mahaldır? Ancaq mənimki nalə, səninki sualdır.* M.Ə.Sabir. *Yanaşar bəstəri-ətfalə ana; Uyqudan yavrusu istər oyana.* A.Səhhət. [Nazlı Marala:] *Mən sənə ana yerindəyəm, yavrum! Nə dərdin varsa, aç söylə!* H.Cavid. *Məsum yavrusunun buz kimi soyumuş çöhrəsi bir an belə* [ananın] *gözlərinin qabağından getmirdi.* M.Hüseyn.

**YAVRUCUQ** "Yavru"dan *oxş. Lay-lay mələyim, sevdiciyim, yavrucuğum yat; Bir də ələ düşməz bu çocuqluq dəmi, heyhat!* A.Şaiq. *Zəhra yuvası dağılmış bu yavrucuqların, analarını itirmiş bu üç qızın halını, ürək parçalayan səmimi göz yaşlarını görərək ixtiyarsız gözləri yaşardı.* S.Hüseyn.

**YAVUQ** *sif.* Yaxın. *Qarı gəlir bizə yavuq; Əl-ayağı tutub soyuq.* "Koroğlu". *Mehmanlara var saf suyun özgə səfası; Derlər ki, yavuqdur ola on dörd gecəlik ay.* Qövsi. [Xədicə:] [Nazlını] *özümə bacıdan yavıq adam bilib hamı gizlin olan fikirlərimi sənə demişəm.* N.Nərimanov.

**YAVUQLAŞMA** "Yavuqlaşmaq"dan *f.is.*

**YAVUQLAŞMAQ** *f.* Yaxınlaşmaq. *Elə ki Bahadır Sonaya yavuqlaşdı, Sona gülümsünüb ağ əlləri ilə Bahadırın əllərindən tutub çəkdi.* N.Nərimanov. [Mirzə] *stola tərəf yavuqlaşıb kağızda yazı görüb oxudu: – Dərvazəmizi fələk vurubdu.* Ə.Haqverdiyev.

**YAVUQLU** *sif.* və *is. məh.* Adaxlanmış, nişanlanmış; adaxlı, nişanlı, deyikli.

**YAVUQLUQ** *is.* Yaxınlıq. *İtaliya məmləkətinin Napoli* [Neapol] *şəhərinin yavuqluğunda bir qədim bütpərəstlərə təəllüq ibadətgahın xərabəsi var.* H.Zərdabi. [Kətxuda] *bilirdi ki, bunlara yavuqluq etsə, qulluq işləri də yaxşı gedəcəkdir.* N.Nərimanov.

**YAVUZ** *sif. qəd.* 1. Şiddətli, çox sərt və tünd, yaman.

2. Məharətli, ustad. *Yavuz çox sağlam bayatı sevər; Gah öyünər, tək-tək özündən deyər.* M.P.Vaqif.

**YAY**[1] *is.* İlin, yazla payız arasında olan ən isti fəsli. *Yayın isti günləri. Yay günləri. Yay meyvələri. Yay tətili. Yay istirahəti. – Hamı bunu bilir ki, yay fəsli üç ay məktəblər bağlıdır.* C.Məmmədquluzadə. *Bu il yay tətili münasibəti ilə .. vətənə gəlmiş dayım mənimlə görüşdükdə anama dedi: – Bunun da oxumaq zamanı çatmış.* S.S.Axundov. *Nə gözəldir dolaşmaq isti yay fəsilləri; Bu sərin sahilləri.* M.Müşfiq. □ **Yaydan-yaya** – hər ilin yayında, hər dəfə yayda.

**YAY**[2] *is.* 1. Ox atmaq üçün yarımdairə şəklində əyilib ucları tarım iplə birləşdirilmiş ibtidai silah. *Dəmirçioğlu yayı çiynindən aşırdı, oxları bir-bir çilləyə-kamana mindirib yerindən tərpənəni vurub yerə saldı.* "Koroğlu". *Şah oxluqdan bir ox alıb yaya qoyur.* A.Şaiq. □ **Yaya dönmək** *məc.* – düz, şaquli vəziyyətini itirmək, əyilmək. *Qaşların əyrisin yad eylədikcə; Qamətim əyilib, yaya dönmüşəm.* M.P.Vaqif.

2. Spiral şəklində burulmuş məftil. *Polad yay. Saatın yayı. Çaxmağın yayı sınıb.* // Hərəkət zamanı təkan və sarsıntının təsirini azaltmaqdan ötrü avtomobil, vaqon və s. minik vasitələrinin, banla ox arasında olan, bir-birinə pərçim edilmiş, adətən bir neçə qat uzun elastik polad lövhələrindən ibarət hissəsi. *Araba yayı. Vaqonun yayları.*

3. *məc.* Klassik şeirdə: gözəlin qaşına işarə. *Can alar qaşı, tökər kirpiyi qan; Mərhəba, ol oxa, ol yayə baxın!* Heyran xanım. *Ləb qönçə, diş inci, yanağı lalə; Çəkilib qaşların yay, Sarıköynək!* Aşıq Ələsgər.

◊ **Ox atıb yayını gizlətmək** – fikrini tamamilə deməmək, eyhamla, işarə ilə kifayətlənmək. *Ox atıb gizləmə dalında yayı.* M.Rahim.

**YAYBAŞI** *zərf* Yayın başlanğıcında, yayın əvvəlində, yay girəndə. *Yaybaşı Bəbir bəy külfəti* [dağa] *aparmaq istədi.* Mir Cəlal.

**YAYCI** *is.* Qədim türkdilli tayfalardan biri.

**YAYCIQ** *is.* Balaca yay.

**YAYÇI(LAR)** *is.* Qədim türkdilli tayfalardan biri.

**YAYDIRMA** "Yaydırmaq"dan *f.is.*

**YAYDIRMAQ** *icb.* Başqasına yayma işi gördürmək, yaymağa məcbur etmək.

**YAYDIRTMA** "Yaydırtmaq"dan *f.is.*

**YAYDIRTMAQ** b a x **yaydırmaq**.

**YAYĞIN** *sif.* 1. Tez yayılmaq xassəsi olan, tez yayılan; sıyıq.

2. *məc.* Konkret, dəqiq olmayan, lazımınca aydın olmayan; qeyri-müəyyən. *Yayğın fikir.*

**YAYĞINLAŞDIRILMA** "Yayğınlaşdırılmaq"dan *f.is.*

**YAYĞINLAŞDIRILMAQ** *məch.* 1. Yayğın hala salınmaq, yayğınlıq xassəsi verilmək; sıyıqlaşdırılmaq.

2. *məc.* Konkretlikdən, aydınlıqdan, dəqiqlikdən məhrum edilmək.

**YAYĞINLAŞDIRMA** "Yayğınlaşdırmaq"-dan *f.is.*

**YAYĞINLAŞDIRMAQ** *f.* 1. Yayğın hala salmaq, yayğınlıq xassəsi vermək; sıyıqlaşdırmaq.

2. *məc.* Konkretlikdən, aydınlıqdan, dəqiqlikdən məhrum etmək. *Fikri yayğınlaşdırmaq.*

**YAYĞINLAŞMA** "Yayğınlaşmaq"dan *f.is.*

**YAYĞINLAŞMAQ** *f.* 1. Yayğın hala düşmək, yayğınlıq xassəsi almaq; sıyıqlaşmaq.

2. *məc.* Konkretliyini, dəqiqliyini itirmək.

**YAYĞINLIQ** *is.* 1. Tez yayılmaq xassəsi, yayğın şeyin halı; sıyıqlıq.

2. *məc.* Qeyri-müəyyənlik, qeyri-konkretlik; bir şeydə lazımınca aydınlıq, konkretlik, müəyyənlik olmaması.

**YAYXAMA** "Yayxamaq"dan *f.is.*

**YAYXAMAQ** b a x **yaxalamaq**[2].

**YAYXANMA** "Yayxanmaq"dan *f.is.*

**YAYXANMAQ** *f. dan.* 1. Yayılıb oturmaq və ya uzanmaq. *Sultan stulda yayxanaraq gözlənilmədən qəhqəhə çəkdi.* İ.Hüseynov.

2. Yırğalanaraq yerimək. [Cuma] *gəminin hərəkətinə görə sağa-sola yayxanaraq ağır addımlarla kayutdan çıxdı.* Ə.Əbülhəsən. *Ağ mayaların üstündə oturub yayxana-yayxana* (z.) *gedən qoca qarıların qucağında camış balası .. gözə dəyirdi.* Ə.Vəliyev.

**YAYXINMAQ** *f. dan.* 1. Kənara çıxmaq, qırağa çəkilmək, özünü kənara çəkmək.

2. İşdən boyun qaçırmaq, yayınmaq.

**YAYICI** *sif.* 1. Bir şeyi yayan, intişar etdirən, yayılmasına səbəb və ya vasitə olan. *Ağcaqanadlar malyariya xəstəliyinin yayıcısıdır.*

2. *xüs.* Yastıladan, yayan. *Yayıcı dəzgah.*

**YAYIQ** *sif. məh.* 1. Göz qabağında olmayan, uzun müddət öz yurdundan, ev-eşiyindən uzaq düşən, uzaqda olan.

2. Tənbəl, ərincək.

**YAYIQLIQ** *is.* Göz qabağında olmama, gözdən uzaq olma, uzaqda olma.

**YAYILMIŞ** *is.* Yayılmaq işi, yayılma, intişar etmə.

**YAYILMA** "Yayılmaq"dan *f.is.*

**YAYILMAQ** *f.* 1. Öz əhatə, təsir, nüfuz dairəsini genişləndirmək, geniş sahə tutmaq, əhatə etmək; genişlənmək, intişar etmək. *Xəstəlik yayıldı. Müharibə atəşi bir çox ölkələrə yayıldı. Daşqın suları hər tərəfə yayıldı. – Yağ əridikcə közün üstünə damcılayıb cızıldayır, seyrək tüstü qalxıb sakit havada yayılır, həyəti kabab iyi bürüyürdü.* İ.Hüseynov.

2. Hər tərəfdə eşidilmək, hər yerdə məlum olmaq. *Xəbər çox tez yayıldı. Şöhrəti yayılmaq* (*məşhurlaşmaq*). *– Mirzənin ölməyinin xəbəri şəhərə yayıldı.* Ə.Haqverdiyev. *Yayılır ətrafa qarmonun səsi; Təmiz bir vicdanın saf zümzüməsi.* S.Vurğun.

3. *məc.* Zahir olmaq, görünmək, gəlmək. *Birdən Leylanın çatılmış qaşları açıldı, üzünə bir təbəssüm yayıldı.* Ə.Məmmədxanlı.

4. *məc. dan.* Çox sərbəst vəziyyətlə oturaraq və ya uzanaraq çoxlu yer tutmaq. *Nə yayılmısan divanda? – Hikmət İsfəhani qıçlarını uzadaraq kresloya yayıldığı halda və təsbeh çevirə-çevirə gözünün ucu ilə İranpərəstə baxdı.* M.İbrahimov.

5. Yayğın hala gəlmək. *Xəmir yayılmışdır.*

**YAYIM** *is.* Yaymaq işi.

**YAYINDIRMA** "Yayındırmaq"dan *f.is.*

**YAYINDIRMAQ** *f.* 1. Fikrini, diqqətini, nəzərini bir şeydən uzaqlaşdırmaq, kənara, başqa tərəfə cəlb etmək (adətən isimlərlə birlikdə işlənir). *Nəzərini yayındırmaq. Fikrini yayındırmaq. – ..Gözlərimi Şumşadxanımın üzündən bir an belə yayındırmazdım.* M.S.Ordubadi. *Yanında bulunan qadınlar* [Gülzarı] *yayındırmaq və əyləndirmək üçün qrammofon oxudurlardı.* T.Ş.Simurq.

2. Xəbəri olmadan, hiss etdirmədən oğurlatmaq; gizlətmək, itirtmək. [Qədim:] *Balam, sənin atan qulplu qazanları dirigözlü yayındırmazdı?* S.Rəhimov. // Qaçırtmaq; qaçmasına, əkilməsinə imkan yaratmaq.

**YAYINIQ** b a x **yayğın**.

**YAYINMA** "Yayınmaq"dan *f.is.*

**YAYINMAQ** *f.* 1. Başqa yerə (cəhətə, şeyə və s.) cəlb olunmaq, başqa şeylə məşğul

olmaq, kənara çıxmaq (adətən “fikri, nəzəri, diqqəti” və s. sözləri ilə). *Fikri yayınmaq*. // Qaçmaq. *Fikrindən yayınmaq*. – [Gülsənəmin] *narazılığını büruzə verən bu hərəkəti Tahirin də, Cəmilin də nəzərindən yayınmadı*. M.Hüseyn.

2. Cürbəcür bəhanələrlə boyun qaçırmaq, can yandırmamaq. *Tapşırılan işdən yayınmaq .. nə qədər çətindir*. S.Rəhimov.

3. *dan.* Xəlvəti getmək, qaçmaq, gözdən itmək, yox olmaq, aradan çıxmaq; əkilmək, gizlənmək. // Uzaqlaşmaq, getmək. *Al-yaşıl geyinib durma qarşıda; Yayın bədnəzərdən, göz dəyər sənə*. Qurbani. [Tarıverdi:] *Barı qaçım, .. vaqt ikən bir tərəfə yayınım.* M.F.Axundzadə. [Nağı:] *Söylədi: – Qardaşlar, gəlin yayınaq; Çoxdandır Samuxa olmuşuq qonaq*. H.K.Sanılı. *Axşam istirahətindən sonra qızlar əl-ələ verib parka çıxanda mən yayınırdım*. Mir Cəlal.

4. Yandan keçmək, hədəfə dəyməmək; sapmaq. *Gündən-günə* [Kərimin] *atdığı güllə daha heç yayınmırdı*. S.Rəhimov. // Canını qurtarmaq, qaçmaq, qaçıb qurtara bilmək. *Güllədən ilan yayınası deyil. – Sonadı, ovçusundan; Yayındı yana, yeridi..* Aşıq Ələsgər.

**YAYIŞMA** “Yayışmaq”dan *f.is.*

**YAYIŞMAQ** *f.* Kütləvi halda hər tərəfə yayılmaq; dağılışmaq.

**YAYQI** *is.* Yerə və ya döşəmə üzərinə sərilən şeylər: palaz, xalça, həsir, cecim və s.

**YAY-QIŞ** *zərf* Hər zaman, həmişə, ilin bütün fəsillərində. *O, yay-qış başaçıq gəzir.*

**YAYLA** *is.* 1. Yaylaq. [Molla Həmid:] *Allaha şükür, belə səfalı yerdə, yaylada damaq çağ olmazmı?* M.F.Axundzadə.

2. *coğr.* Dağlıqda olan düzən yerlər. *Qarabağ yaylası. – Yaylanın başından hay-küy səsi gəlirdi*. Mir Cəlal. *Nəhayət, onlar yoxuşun başına çatıb hamar və yüksək bir yaylaya çıxdılar.* Ə.Məmmədxanlı.

**YAYLAQ** *is.* Sərinliyinə görə yay istirahəti üçün əlverişli olan dağ yeri. *Yaylaq havası. Yaylaqda istirahət etmək. Yaylağa köçmək. – İnək, camış, qoyun, quzu; Çıxar naxırda otlağa; Köçər arandan el, gedər; Yavaş-yavaşca yaylağa*. A.Səhhət. *Qaldı Qızdırmalı. Bu Allahın balasına giriftar olmuş da yaylaqlarda veyillənməkdən yorulmadı*. C.Məmmədquluzadə. *Ehtiyat xala .. səfalı yaylaq şəhərində yaşayırdı*. Mir Cəlal. // Yayda qoyun və malqara sürülərinin saxlandığı yer (*qışlaq* müqabili). // Ümumiyyətlə, sərin və səfalı yer.

**YAYLAQÇI** *is.* İstirahət üçün yaylağa gəlmiş, yaylaqda dincələn adam. *Bu yay İstisuda yaylaqçıların sayı-hesabı yox idi.*

**YAYLAQLAMA** “Yaylaqlamaq”dan *f.is.*

**YAYLAQLAMAQ** *f.* Yaylaqda istirahət etmək, yayı dağlıq və sərin yerdə keçirmək.

**YAYLAQLANMA** “Yaylaqlanmaq”dan *f.is.*

**YAYLAQLANMAQ** b a x **yaylaqlamaq**.

**YAYLAQLIQ** *is.* 1. Yaylaq.

2. Yaylaq üçün lazım və yararlı olan şey.

**YAYLAMA** “Yaylamaq”dan *f.is.*

**YAYLAMAQ**[1] *f.* 1. Yay vaxtını bir yerdə keçirmək, istirahət etmək (*qışlamaq* müqabil). *Dağlarda yaylamaq. Bu il harada yaylamışdınız? – Getmə, dağlar səndən xəbər alayım; Sinəndə yaylayan ellər necoldu?* “Koroğlu”. *Hanı bu yaylaqda yaylayan ellər? Görəndə gözümdən car oldu sellər.* Aşıq Ələsgər.

2. Yaylaqda otlamaq, yaylaqda olmaq.

3. *məc.* Yay olmadığı halda ona xas olan işlər görmək.

**YAYLAMAQ**[2] *f.* Yay qoymaq, yayla bərkitmək (b a x **yay**[2] 2-ci mənada).

**YAYLANMA** “Yaylanmaq”dan *f.is.*

**YAYLANMAQ** *məch.* Yay qoyulmaq, yayla bərkidilmək (b a x **yay**[2] 2-ci mənada).

**YAYLATMA** “Yaylatmaq”dan *f.is.*

**YAYLATMAQ** *icb.* Yayı yaylaqda saxlamaq, yaylaqda qalması üçün şərait yaratmaq, yaylamağa məcbur etmək.

**YAYLI** *sif.* Yayı olan. *Yaylı kürsü. Yaylı oyuncaq. – Bu vaxt Əhməd yaylı krovatın üzərində uzanıb ağır-ağır nəfəs alırdı.* Ə.Vəliyev. *Ağır yaylı qapının bir tayı ləngər ilə aralanmağa başladı*. Mir Cəlal.

**YAYLIQ**[1] *sif.* Yay fəslinə aid olan, yaya məxsus, yay üçün ayrılmış (hazırlanmış). *Yaylıq paltar.* – [Bəbir bəy] *qalxıb Məşədi Cahangirə bir boşqab yaylıq üzüm gətirdi*. Mir Cəlal.

**YAYLIQ**[2] *is.* Üçkünc və ya dördkünc parçadan ibarət qadın baş örtüsü. *Yaylığı başına örtmək. Başında yaylıq. Başını yaylıqla sarımaq.* – [Xırdaxanım:] *Pəri, otaqda .. bir yaylıq var, ört başına, onu sənə bağışladım.*

N.Vəzirov. [Qadın] *başından nimdaş yaylığını da çıxarıb körpəni bürüyür*. Ə.Məmmədxanlı. // Burun, üz, tər silmək üçün dördkünc parça. *İpək yaylıq. Burun yaylığı. – Yaylığı kirli balam; Qəlbi fikirli balam; Cahıl-cuhul içində; Mənim şəkilli balam*. (Bayatı). *Hə, .. bölükdən xoşun gəldimi? – deyə, kapitan yaylıqla alnının tərini sildi*. Ə.Əbülhəsən.

**YAYLI-QIŞLI** bax **yay-qış**.

**YAYLIM[1]: yaylım atəşi** – bir neçə silahdan eyni zamanda açılan atəş. *Yaylım atəşi açıldı, dəstələrdən soldatlara daş atmağa başladılar*. M.S.Ordubadi. *Çəkilib soldatlar, yerə yatdılar; Yaylım atəşini peydər atdılar*. H.K.Sanılı. *O taydan qalxdıqca bir qara dəstə; Yaylım atəşləri yayıldı düzə*. S.Vurğun. ☐ **Yaylım güllə** – bax **yaylımı güllə ("yaylımı[1]"**da).

**YAYLIM[2]** *is.* Mal-qaranın gecə otarılması. *Çəkirdi yaylıma sürünü çoban; Olurdu qaçaqlar yoluna rəvan*. H.K.Sanılı. *Yazda Rüstəm özü mal-qaranı yaylıma aparmağa çalışar*. S.Rəhimov. *Almurad baba .. gecə biz yuxuda ikən qoyun-quzunu yaylıma çıxarırdı*. İ.Əfəndiyev.

**YAYLIMI[1]** *sif.* Yaylımla atılan. ☐ **Yaylımı güllə** – çovumuş (sovuşan, naqafil) güllə. ◊ ...**yaylımı gülləyə gələsən** – qarğış ifadəsi. [Nurcahan:] *..A səni yaylımı gülləyə gələsən, .. bu nə sözlərdir ki, özündən qayırırsan?!* N.Vəzirov.

**YAYLIMI[2]** *is. məh.* Musiqi havası. *Xan Sultan tütəyi ağzına aldı, bir yaylımı çaldı*. S.Rəhimov.

**YAYLIMLAMA** "Yaylımlamaq"dan *f.is.*

**YAYLIMLAMAQ[1]** *f.* Yaylım atəşi açmaq, bir yerdə eyni zamanda güllə atmaq.

**YAYLIMLAMAQ[2]** *f.* Mal-qaranı gecə otlamasına çıxarmaq.

**YAYLIMLATMA[1]** "Yaylımlatmaq[1]"dan *f.is.*

**YAYLIMLATMA[2]** "Yaylımlatmaq[2]"dan *f.is.*

**YAYLIMLATMAQ[1]** *icb.* Yaylım atəşi açdırmaq, eyni zamanda hamıya birdən atəş açdırmaq, silahların hamısı ilə birdən atəş açdırmaq.

**YAYLIMLATMAQ[2]** *icb.* Mal-qaranı gecə otlatmaq (otlamağa çıxartdırmaq).

**YAYMA** 1. "Yaymaq"dan *f.is.*

2. *is.* Acıtmasız xəmirdən bişirilən nazik çörək. [Telli] *sobanı qalayıb sac asdı, yayma bişirməyə başladı*. S.Hüseyn. ☐ **Südlü yayma** *məh.* – südlə düyüdən bişirilən xörək; südlüsıyıq. [Tubu Gülnisəyə:] *Bir az düyü arıtla, atana bir dövrə südlü yayma bişir.* Ə.Haqverdiyev.

3. *is. tex.* Metalı hərlənən vallar arasında saxlamaqla ona istənilən formanın verilməsi. *Zavodun yayma sexi*.

**YAYMAÇI** *is. xüs.* Yayma işi ilə məşğul olan adam (bax **yayma** 3-cü mənada).

**YAYMAQ** *f.* 1. Bir şeylə yastıladaraq nazik qat halına salmaq, uzatmaq, açmaq, böyütmək. *Qadınlardan birisi yuxa yayır, o birisi də çevirirdi.* Ə.Vəliyev.

2. Ətrafa səpələmək, dağıtmaq, tək-tək, sərbəst otlamağa buraxmaq. *Sürünü otlağa yaymaq*. – [Kərim baba:] *Qışlaqda idik, payızın aydınlıq gecəsi idi. Qoyunları yayıb bir daş üstündə uzanmışdım*. A.Şaiq.

3. Hamıya bildirmək, hamının bilməsinə səbəb (vasitə) olmaq. *Söz yaymaq. Şayiə yaymaq. Xəbər yaymaq*. – [Zeynal:] [İncə] *onabuna xəbər yayıb*. C.Cabbarlı. [Ağarza:] *Pis olmaz ki, şikayətlərinizi üzümüzə deyəsiniz. Biz də nöqsanımızı bilək, .. nəinki dalda danışmaq, söz yaymaq, filan.* Mir Cəlal. ☐ **Xalqa (camaata) yaymaq** – hamıya bildirmək, hamıya tanıtmaq, hamıya xəbər vermək. *Molla Cümə sənin vəsfin deyibdi; Götürübən əziz xalqa yayıbdı*. Molla Cümə.

4. Təbliğat məqsədi ilə paylamaq, intişar etmək, dağıtmaq. *Vərəqləri yaymaq isə Tütünçüoğluna və Həsənağaya tapşırıldı*. M.S.Ordubadi. *..Firidungil ikinci kitabdan yüzünü darülfünun tələbələri, məktəblilər, müəllimlər arasında yaymış, üç yüzünü fəhlələrə və əsnafa çatdırmışdılar*. M.İbrahimov.

5. Başqalarına öyrətmək məqsədi ilə intişar etdirmək. *Qabaqcılların təcrübəsini geniş yaymaq.*

6. Öz təsirini (səsini, iyini və s.) ətrafda hiss etdirmək (eşitdirmək), ətrafa saçmaq, ətrafı doldurmaq. *Çiçəklər ətrini ətrafa yayırdı. – Küləklər yayırdı geniş düzlərə; Muğan qızlarının şərqilərini.* S.Vurğun. *Yavaş-yavaş çıxmaqda olan Ay öz .. işığını ətrafa yayırdı.* M.İbrahimov.

**YAYMALIQ** *sif.* Yayma üçün yararlı (ayrılmış). *Yaymalıq un.*

**YAY-OX** b a x **ox-yay**.

**YAZ** *is.* İlin qış ilə yay arasında olan fəsli: bahar. *Yaz gəldi. Yaz çıxdı. Yaz çiçəyi. Yaz fəsli. Yaz yağışı. Yaz şumu. – Bir gül ilə yaz olmaz.* (Ata. sözü). [Qurbanəli:] *Elə ki genə yaz açıldı, hamısı genə kənd işlərinə gedəcəklər.* N.Nərimanov. *Bu yaz başqa yazdır, bu yaz daha da xoşdur; Vay o qəlbə ki boşdur.* M.Müşfiq. ◻ **Yaz ağzı** – yazın başlanğıcı. *Yaz ağzı molla bazardan bir ikicanlı keçi alır ki, südü ilə uşaqlarını dolandırsın.* "M.N.lətif." **Yaz başı** – yazın əvvəli. *Bax dumana dağ başında; Dərdə düşmüş gül yaşında; Coşmuş gözlər, yaz başında; Duman ağlar, bən ağlaram!* Ə.Cavad. *O enən, o qalxan səslər, avazlar; Yaz başı dağların selidir, bəlkə?* B.Vahabzadə. **Yazdan-yaza** – hər ilin yazında, hər yazda.

**YAZDIRILMA** "Yazdırılmaq"dan *f.is.*

**YAZDIRILMAQ** *məch.* Yazmağa məcbur edilmək, başqasına yazma işi gördürülmək.

**YAZDIRMA** "Yazdırmaq"dan *f.is.*

**YAZDIRMAQ** *icb.* 1. Yazmağa məcbur etmək, başqasına yazma işi gördürmək, başqası vasitəsilə yazmaq. *Məktub yazdırmaq. Şagirdlərə imla yazdırmaq.* – [Qurban] *kisəsini çıxarıb iki şahı mollanın ovcuna sıxaraq: – Al, həmşəri! Bayramqabağı yenə məktub yazdıracağam.* A.Şaiq. *Qızın məktubundan qeyzlənərək; Yanıqlı bir məktub yazdırdı ona.* B.Vahabzadə. ◻ **Deyib (söyləyib) yazdırmaq** – diktə etmək.

2. Siyahıya daxil etdirmək. *Könüllü yazdırmaq. Əsgərliyə yazdırmaq.*

3. Başını bağlatdırmaq. [Kərbəlayı Qubad:] *Bu saat pulu ver, yoxsa gedib bu saat notariusu gətirrəm, evini yazdıraram.* Ü.Hacıbəyov.

**YAZI**[1] *is.* 1. Yazmaq üçün tətbiq edilən qrafik işarələr sistemi; əlifba. *Ərəb yazısı. Slavyan yazısı. Qot yazısı. Çin yazısı.* ◻ **Yazı ləvazimatı** – yazmaq üçün lazım olan şeylər: qələm, mürəkkəb, kağız və s. **Yazı masası (stolu)** – yazı işləri üçün xüsusi şəkildə düzəldilmiş stol. *Səlimnaz arvad yazı stolunun üstünə dağılmış xırdaca kağız parçalarına baxdı.* M.Hüseyn. **Yazı makinası** – yazı yazmaq üçün xüsusi sistemli maşın. **Yazı taxtası** – üzərində təbaşirlə yazmaq üçün enli qara lövhə. – *Divardakı yazı taxtasını, skamyaları, xəritəni görəndə bayaqkı kazak yenidən bağırdı: – Bu nədir?* İ.Şıxlı. // Yazılmış şeyin zahiri görünüşü; xətt. *Aydın yazı. Qarışıq yazı. Yazısı pis deyil.*

2. Kağız və ya başqa material üzərində yazılmış şeylər; xətt. *Şəklin altındakı yazılar. – Səlim baş-başa düzülən daşların yazılarını oxumaqla Mehribana məlumat verərək əylənirdi.* S.Hüseyn. // Hər hansı bir dövrə və xalqa aid yazılı abidələr. *Orxon yazıları. Qədim alban yazıları. Qədim yazılar.*

3. Savad, yazı-pozu, yazma qabiliyyəti. *Yazı yaza bilmir. – Nə yar yazı bilir, yazıb göndərəm; Nə deyən var o dildarə dərdimi.* Q.Zakir.

4. Yazılmış hər hansı bir şey; əsər, məqalə, mətn və s. *Yazının mətnini hazırlamaq.* – [Zeynalın] *xüsusi yazılar və tərcümələrdən də mədaxili vardı.* S.Hüseyn.

5. *məc.* Bəxt, tale mənasında. *Əlimə almışam sədəfli sazı; Fələk yazdı mənə belə bir yazı!* "Aşıq Qərib". *Əzəl başdan belə yazıldı yazı; Şirindi söhbəti, şirindi sazı.* Qurbani.

◊ **Yazı qaydaları** – düzgün yazma qaydaları; orfoqrafiya.

**YAZI**[2] *is. qəd.* Çöl, səhra, düzən. [Əhməd tacirbaşı:] *..Bayazid yazısında yaxşı ceyranlar olur, göndər, onlardan vurub gətirsinlər, bizə ceyran kababı ver.* "Koroğlu". *Bu zəfilə, Qövsi, məni yazılara salmaz; Gər mur dilin bilsə Süleymani-zəmanın.* Qövsi. // Çöl, eşik, bayır. *Bu bəzmi-xasi-ünsdür, aramgahi-qüdsdür; Aç qapını, sal yazıya biganəni, biganəni.* Ə.Nəbati.

**YAZIB-OXUMAQ** *f.* Oxu-yazı bilmək, oxuyub-yazmağı bacarmaq, savadlı olmaq.

**YAZIB-POZMAQ** *f. dan.* 1. Yazı işləri ilə məşğul olmaq. // Bir şey yazmaq. *Yazır-pozur Səbuhi; Qulaqları səsdədir.* H.Hüseynzadə.

2. Bir şey haqqında götür-qoy etmək, fikirləşmək. *Qocalar düşünüb yazıb-pozdular.* M.Rahim.

**YAZIB-YARATMAQ** *f.* Əsər yazmaqla, əsər yaratmaqla, yazıçılıqla məşğul olmaq. *M.F.Axundzadə XIX əsrdə yazıb-yaratmışdır.*

**YAZICI** *sif. tex.* Yazan, qeyd edən. *Yazıcı cihazlar. – Yüklərin qiyməti və nasosun təzyiqi*

*yazıcı cihazdakı iki qələmlə indikatorun diaqramı üzərinə yazılır.* S.Quliyev.

**YAZIÇI** *is.* Bədii əsərlər yazan, ədəbi yaradıcılıqla məşğul olan adam. *İstedadlı yazıçı. Gənc yazıçı. Yazıçılar İttifaqı. – Məlum şeydir ki, alimlərimiz və şöhrətli yazıçılarımızın çoxu Bakıdadırlar.* C.Məmmədquluzadə. *..Heyfən ki, yazıçıların nalə və fəryadı sahibi-ixtiyarların və dadrəslərin qulaqlarına yetişməyibdir.* F.Köçərli. *Əgər yazıçı öz oxucusunu həyəcanlandırmırsa, o, yazıçı deyildir.* C.Cabbarlı.

**YAZIÇILIQ** *is.* Yazıçının sənəti, peşəsi. *Yazıçılıq istedadı. Yazıçılıq təcrübəsi. Yazıçılıq çox çətin, lakin şərəfli sənətdir. – Müəllimi Süleyman Saninin* "*Məktəb*" *jurnalında dərc olunan .. hekayələrini oxuyan Cəfərdə yazıçılıq həvəsi getdikcə daha da artırdı.* M.Arif.

**YAZIXANA** *is.* Dəftərxana, yazı işləri aparılan yer, otaq.

**YAZIQ**[1] *sif.* Dinc, sakit, fağır, aciz. *Yazıq adam. – Yazıq Ələsgəri oda salıbdı; Fələk gözdən salıb, o da salıbdı.* Aşıq Ələsgər. *Gah müdirin acıqlı qaşqabağı; O sayaq qorxudub yazıq uşağı..* A.Səhhət. *Vəzirov yenə də aciz və yazıq bir görkəm alıb, boynunu yana sarı əydi.* M.Hüseyn. // İs. mənasında. [Əkinçi] *Xanı görcək yazıq baş endirdi; Gör onu xan nə gunə dindirdi.* S.Ə.Şirvani. *Yazıqlar çəkildi bir az uzağa; Dözməzdi Ayişə bu ağır dağa.* H.K.Sanılı. // Acınacaqlı, zavallı, bədbəxt. *Etmək olmaz səni agah könül halından; Yazıq ol kim, sənə könlün verə səndən qafil.* Füzuli. [Tanrıverdi:] *Yazıq Qurban, sən qəbrini öz əlinlə qazdın, – dedi.* A.Şaiq. [Musa kişi:] *Arvad, .. bu ətdən bir tikə də o Həsənəlinin yetimlərinə göndər, yazıqdırlar.* M.İbrahimov. ☐ **Yazığı gəlmək** – rəhmi gəlmək, mərhəmət etmək, halına acımaq, heyfi gəlmək. *Mənim ona yazığım gəlir. – ..Balaca quşcuğazlara yazığın gələrsə, analarını buraxarsan..* S.S.Axundov. // İntonasiyadan asılı olaraq bəzən kinayə, etinasızlıq, istehza məqamında işlənir. *Ay yazıq!* – [Bəhram:] *Bax, mənə nə deyir, yazıq! Sən nə ətsən, nə də balıq.* A.Şaiq.

**YAZIQ**[2] *sif. məh.* Yumurtladığı yerini yadırğamış, yayınmış. *Yazıq toyuqdan yumurta umma.*

**YAZIQCASINA** *zərf* Yazıq adam kimi, yazıq-yazıq, fağır-fağır, məzlum-məzlum. *Mişa bu sözləri o qədər yazıqcasına və yanıqlı bir dillə söylədi ki, Arazın ürəyi yandı.* A.Şaiq.

**YAZIQCIĞAZ** "Yazıq"dan *oxş.* [Əbdül:] *Bir neçə ay bundan qabaq Sara bu evdə xanım idi. İndi.. adamsız kənizlər kimi bu qaranlıq daxmada can üstündədir... Yazıqcığaz dəxi ağır dəqiqələrdədir.* C.Cabbarlı.

**YAZIQDIRMA** "Yazıqdırmaq"dan *f.is.*

**YAZIQDIRMAQ** *f. məh.* Yazıqmasına səbəb olmaq: azdırmaq, yayındırmaq.

**YAZIQLIQ** *is.* Fağırlıq, məzlumluq, acizlik, yazıq adamın hal və vəziyyəti. *O, bütün yazıqlığı, kimsəsizliyi və köməksizliyi ilə göz önündə canlanır.* Mir Cəlal.

**YAZIQMA** "Yazıqmaq"dan *f.is.*

**YAZIQMAQ** *f. məh.* Yadırğamaq, yerini azmaq.

**YAZIQ-YAZIQ**[1] *zərf* Yazıq vəziyyətdə, fağır-fağır, məzlum-məzlum. *Yazıq-yazıq baxmaq. Yazıq-yazıq oturmaq. Yazıq-yazıq danışmaq. – Yazıq-yazıq dayanaraq o, əlləri qoynunda; Buyur, məni öldür, deyər qul zənciri boynunda.* S.Rüstəm. *Gülsəhər yazıq-yazıq dayanıb göz yaşı axıdır, bir yumub, min tökürdü.* Ə.Vəliyev. *Əlləzoğlu yazıq-yazıq boynunu bükdü.* İ.Hüseynov.

**YAZIQ-YAZIQ**[2] *zərf* Bütöv yazılı halda, hər yeri yazılmış, qaralanmış halda. *Kağızı yazıq-yazıq etmək.*

**YAZIQ-YUZUQ** *top. dan.* Yazıq, aciz, fağır adamlar; əlsiz-ayaqsızlar. *Koroğlu həmişə yazıq-yuzuğun, əlindən iş gəlməyən adamların dalınca ya özü gedər, ya da dəlilərin say-seçmələrindən göndərər.* "Koroğlu".

**YAZILI** *sif.* 1. Üstündə bir şey yazılmış, üstündə yazı olan. *Yazılı daş. – Milis rəisi gözlərini əlindəki yazılı kağıza dikib, gərgin vəziyyətdə nə isə düşünürdü.* Ə.Vəliyev.

2. Qrafik işarələr (yazı) vasitəsilə ifadə olunmuş; yazılmış. *Yazılı məlumat. Yazılı imtahan. Yazılı nitq. Yazılı* (z.) *surətdə müraciət etmək. – Yeriyib bir nəfər əfsər; Verdi qubernata yazılı xəbər.* H.K.Sanılı.

**YAZILIŞ** *is.* 1. Yazılmaq tərzi, üsulu; yazmaq işi, yazma prosesi. *Əsərin yazılış planı. Məqalənin yazılışı.*

2. İmla. *Sözün yazılışı düz deyil.*

**YAZILMA** "Yazılmaq"dan *f.is.*

**YAZILMAQ** *məch.* 1. Kağız və ya başqa material üzərində qrafik işarələr (hərflər, rəqəmlər və s.) cızılmaq. *Bayram bir vərəq kağızda səliqə ilə yazılmış tələbnaməni Rəhim bəyə uzatdı.* M.Hüseyn.

2. Bir şeyin yazılı mətni hazırlanmaq. *Bu elan Sədrəddin bəyin təhriki ilə yazılmışdı.* S.M.Qənizadə.

3. Bir şey haqqında yazılı məlumat verilmək. *Bu xüsusda yuxarılara yazılmışdır.*

4. Ədəbi-bədii, elmi, musiqi və s. əsərlər yaradılmaq. *Əlbəttə, bizim tarixi mündəricəli günlərimizin günəş kimi parlaq səhifələrinə aid cild-cild kitablar, saysız-hesabsız əsərlər yazılmışdır, yenə də yazılacaqdır.* S.Rəhimov.

5. Bir təşkilata və s.-yə qəbul edilib adı dəftərə qeyd edilmək. *Dərnəyə yazılmaq. Axşam kursuna yazılmaq. Kluba yazılmaq. – Zorxanaya kim yazılsaydı, gərək hər gün oyuna gələydi.* H.Sarabski. // Siyahıya alınmaq, qeyd edilmək, qeydə alınmaq.

6. *dan.* Müsadirə edilmək üçün siyahıya alınmaq, başı bağlanmaq.

**YAZIN** *zərf* Yaz vaxtı, yaz zamanı, yazda, yaz mövsümündə.

**YAZIPİŞİYİ** *is.* Çölpişiyi.

**YAZI-POZU** *is.* 1. Yazı işləri. *Bunun da səbəbi odur ki, mən əhli-savadam, yazı-pozu mənim gözümə ziyan eləyibdir.* C.Məmmədquluzadə.

2. Yazıb-oxumaq bacarığı; savad. [Məhəmmədağa:] *Oğlunuz burada oxuyub yazı-pozu biləcəkdir.* N.Nərimanov. [Şamama Cadu:] *İndi heç az-maz yazıdan-pozudan başın çıxırmı?* Ə.Haqverdiyev. [Cavad:] *Mən bir kasıb odunçuyam, yazı-pozu bilməyirəm.* B.Talıblı.

3. *məc. dan.* Yazılmış şey; əsər, məqalə və s. *Orada məni qonaq elədi və məndən soruşdu ki, yazıdan-pozudan nəyin var?* C.Məmmədquluzadə. *Bəlkə gənclərdir, az-dan-çoxdan mənim yazı-pozumdan oxuyublar, həvəslənirlər? – deyə düşündüm.* S.Rəhimov.

**YAZIŞ** *is.* Yazma, yazılma.

**YAZIŞMA** "Yazışmaq"dan *f.is.;* məktublaşma.

**YAZIŞMAQ** *qarş.* Bir-birinə məktub yazmaq, məktublaşmaq. *Biz onunla çoxdan yazışırıq. Oxucularla yazışmaq. Dostlarla yazışmaq. – ..Biz yazışa-yazışa* (z.) *aylar gəlib keçdi.* M.İbrahimov.

**YAZQABAĞI** b a x **yaz ağzı** ("**yaz**"da). *Bu yazqabağı axşam necə ılıq və necə də xoş idi.* Ə.Əbülhəsən.

**YAZ-QIŞ** *zərf* İlin bütün fəsillərində, hər zaman, həmişə, daim. *Kamalgilin kəndi yaz-qış başıqarlı Kəpəzin ətəklərində idi.* M.Rzaquluzadə.

**YAZLAMA** *f.* 1. Yazı bir yerdə yaşamaq, keçirmək, qalmaq.

2. *dan.* İstilər düşməmiş yüngül geyinmək. *Çox tez yazlamısan.*

**YAZLIQ** *is.* 1. Yaz vaxtı, yaz çağı. *Cənnətin yazlığı, cəhənnəmin payızlığı.* (Ata. sözü).

2. Yazda, baharda əkilən, yaxud yazda yetişən. *Yazlıq buğda.* – [Qarakişi:] *Yoxsa biz bostan üçün, yazlıq əkin üçün ayırdığımız sahəyə su çatdıra bilməyəcəyik!* Ə.Əbülhəsən.

**YAZMA** 1. "Yazmaq"dan *f.is.*

2. *sif.* Əl ilə yazılmış (*basma – çap* müqabili). *Yazma kitablar.*

**YAZMAQ** *f.* 1. Kağız və ya başqa material üzərində qrafik işarələr (hərflər, rəqəmlər və s.) cızmaq. *Hərflər yazmaq. Not yazmaq. Mürəkkəblə yazmaq. Karandaşla yazmaq. Təbaşirlə lövhədə yazmaq. – ..Bir para uşaqlarda belə bir pis xasiyyət olur ki, əllərinə karandaş düşən kimi başlayırlar evin divarlarını yazmağa.* C.Məmmədquluzadə. *Bütün kənd Novruza müştərək kağız yazıb göndərdi.* S.Rəhman. // Yazı işi ilə məşğul olmaq. *Ər oxurmuş da, yazarmış da, anam! Ər deyil, mühlik azarmış da, anam!* M.Ə.Sabir. // Hərfləri, sözləri və s.-ni cızmağı bacarmaq. *Uşaq artıq adını yazır.* // Yazı üçün yaramaq. *Karandaş yaxşı yazır. Qələm pis yazır.*

2. Bir şeyin yazılı mətnini hazırlamaq. *Məktub yazmaq. Təliqə yazmaq. Ərizə yazmaq.*

3. Bir şey haqqında yazılı məlumat vermək; fikrini yazılı və ya mətbu şəkildə bildirmək, söyləmək, ifadə etmək. *Bu xüsusda məqaləmdə yazmışam. Ona yazın ki, tez gəlsin. O xüsusda qəzetdə yazmaq lazımdır. – Oxucularımızdan təvəqqe edirəm ki, müxbirimizin Ordubad və Əylis barəsində yazdığı sözlərə bir qədər əhəmiyyət versinlər.* C.Məmmədquluzadə. [Rza bəy:] *Həzərat, vallah, sabah bunu mən qəzetəmdə yazaram.* Ü.Hacıbəyov. // Məktub vasitəsilə müraciət etmək, bildir-

mək, məktub göndərmək. *Çoxdandır bizə yazmırsan. Yoldaşları müntəzəm surətdə yazırlar.* – [Mərcan bəy:] *Ay kişi, kağızda da yazıbdır ki, sabah altıda gələcəyəm.* Ü.Hacıbəyov.

4. Ədəbi-bədii, elmi, musiqi və s. əsərlər yaratmaq, təlif etmək. *Hekayə yazmaq. Poema yazmaq. Dissertasiya yazmaq. Kantata yazmaq. Opera yazmaq. Balet yazmaq. – Bu qədri şeirdə olmaz nəmək, vəli; Seyyid, ləbin havası ilə yazdı bir kitabi-ləziz.* S.Ə.Şirvani. *Hər gün bir yeni nəğmə, hər gün bir yeni ilham; Yazaydım səhər-axşam*. M.Müşfiq. *Ellərə güvənib yazsa sənətkar; İlham xəzinəsi tükənməz olar.* S.Vurğun. // Mətbuatda iştirak (çıxış) etmək, öz əsərlərini hər hansı bir mətbuatda dərc etdirmək. *O, qəzetə yazır. O, aktyorluqla bərabər arabir yazır.*

5. Bir təşkilata və s.-yə qəbul edib adını dəftərə qeyd etmək. // Siyahıya almaq, qeyd etmək, qeydə almaq. *On üç il bundan irəli evləri yazanda Danabaş kəndinin tüstü çıxanı düz altı yüz əlli ikiyə çatmışdı.* C.Məmmədquluzadə.

6. *dan.* Müsadirə etmək üçün siyahıya almaq, başını bağlamaq. *Cinayətkarın əmlakını yazdılar.*

**YE** "Y" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**YEDDİ** 1. *say*. Altıdan sonra gələn ədədin adı – 7. *Yeddidən üç çıxmaq*. // Miqdarı yeddi. *Yeddi manat. Yeddi nəfər. Yeddi gün. – Dağda yol-iz yaxşıdır; Hər yan nərgiz, yaxşıdır; Yeddi fərsiz oğuldan; Bir fərli qız yaxşıdır.* (Bayatı). *Bir neçə il bundan əqdəm Danabaş kəndində bir uşaq məktəbə gedən gününün sabahısı uşağın atasının yeddi qoyunu bir gecənin içində çərləyib ölür.* C.Məmmədquluzadə.

2. *is.* **Yeddisi** şəklində – ölən şəxsin ölümünün yeddinci günü və həmin gün verilən ehsan. *Bu gün mərhumun yeddisidir. Ölünün yeddisini vermək. – Mirzə rayona çatanda anasının yeddisini vermişdilər, day başsağlığına gəlib-gedən də yox idi.* İ.Şıxlı.

◊ **Yeddi arxa** – əcdad, əsil-nəsəb. [Məşədi Əhməd:] *Ax, a zalım oğlu! Əlbət bir də müsavat hökuməti geri qayıdar, sənin yeddi arxa dönənlərinə od vuracağam*. Ə.Haqverdiyev. **Yeddi qapı qonşu** – uzaq qonşu. *Hələ olur ki, qızlar da gətirir. Yeddi qapı qonşuları bədxab eləyir*. Mir Cəlal. **Yeddi qıfıl (möhür) altında olmaq (saxlanmaq)** – bərk-bərk gizlədilmək, bərk yerdə saxlanılmaq, tamamilə naməlum olmaq, heç kəsə məlum və bəlli olmamaq. **Yeddi dərədən su gətirmək** – çaşdırmaq, bir işi və ya məsələni daha da qaranlıqlaşdırmaq. **Yeddi iqlim** – dünya, aləm. *Eşitsəm gəlirsən, uçaram, inan; Pənbə buludlarla qucaqlaşaram; Açaram köksümü yeddi iqlimə.* X.Rza. **Yeddi göydə bir ulduzu olmamaq** – heç bir arxası, güvənəcəyi, adamı olmamaq. **Yeddisindən yetmişinə qədər** – yeddi yaşlı uşaqlardan tutmuş yetmiş yaşlı qocalaradək; hamı. *S.Vurğunu Azərbaycanda yeddisindən yetmişinə qədər hamı tanıyır.* **Bir dərədə yeddi yetim ilə qalmaq** – köməksiz, kimsəsiz olmaq. *Bir dərədə yeddi yetim ilə ac və susuz qalmamışıq ki! Bizim dövlətimiz dağılan və qurtaran dövlət deyil*. İ.Musabəyov.

**yeddi-yeddi** *zərf* Hər dəfəsində, hər sırada və s. yeddi olaraq. *Yeddi-yeddi sıralanmaq. Yeddi-yeddi ayırmaq. Nümayişçilər yeddi-yeddi gəlib keçdilər.*

**YEDDİARŞINLIQ** *sif.* Uzunluğu yeddi arşın olan.

**YEDDİAYLIQ** *sif.* 1. Yeddi ay davam edən və ya etmiş. *Yeddiaylıq zəhmət. Yeddiaylıq ezamiyyət.*

2. Yeddi ay yaşı olan. *Yeddiaylıq uşaq. Yeddiaylıq dayça.*

**YEDDİBAŞLI** *sif.* Yeddi başı (zirvəsi, təpəsi) olan.

**YEDDİBUCAQLI** *sif. riyaz.* Yeddi bucağı olan.

**YEDDİDƏQİQƏLİK** *sif.* Yeddi dəqiqə davam edən və ya etmiş. *Yeddidəqiqəlik fasilə.*

**YEDDİDİLLİ** *sif.* Yeddi dili olan. *Yeddidilli uşaq qarmonu.*

**YEDDİDÜYMƏLİK** *sif.* Ölçüsü yeddi düymə olan. *Yeddidüymərlik taxta*.

**YEDDİİLLİK** 1. *sif.* Yeddi il davam edən və ya etmiş. *Yeddiillik səyahət. Yeddiillik fəaliyyət.* // Yeddiillik bir müddəti nəzərdə tutan. *Yeddiillik plan.* // Yeddi il müddətində başa gələn. *Yeddiillik məktəb. Onun yeddiillik təhsili vardı.*

2. *is.* Təhsil müddəti yeddi il olan məktəb. *Yeddiillikdə oxumaq. Yeddiilliyi bitirmək.*

– [Bəhram] *Reyhandan elə arxayın idi ki, deyəsən, onu küçələrindəki yeddiilliyə yola salıb.* Mir Cəlal.

3. *is.* Yeddinci ildönümü. *Qələbənin yeddiilliyini qeyd etmək.*

**YEDDİQARDAŞ** *is.* Bir-birinin yanına düzülmüş kimi görünən yeddi kiçik ulduz. *Səhər öz taxtına dönəcək indi; Yeddiqardaş belə sönəcək indi.* M.Rahim.

**YEDDİQAT(LI)** *sif.* 1. Qatları yeddi olan. *Yeddiqat lay.*

2. Yeddimərtəbəli. *Yeddiqat evlər.*

3. *məc.* Çox, qalın, çoxqatlı. *Yeddiqat paltar geymiş, yenə də üşüyür.*

**YEDDİQÜLLƏLİ** *sif.* Yeddi qülləsi olan. *Yeddiqülləli qala.*

**YEDDİLƏMƏ** "Yeddiləmək"dən *f.is.*

**YEDDİLƏMƏK** *f.* Yeddiyə çatdırmaq.

**YEDDİLİK** *sif.* Ölçüsü yeddi vahiddən ibarət olan, yaxud yeddi nömrəli. *Yeddilik piltə. Yeddilik şüşə. Yeddilik taxta. – Yeddilik lampa işığında arıq bir qızın, heç nə ilə nəzəri cəlb etməyən uzunsov çöhrəsi meydana çıxdı.* Ə.Əbülhəsən. // Yeddi xalı olan. *Yeddilik kart.* // *is.* Yeddi xalı olan qumar kağızı. *Yeddiliyi at!*

**YEDDİMETRLİK** *sif.* Yeddi metr uzunluğunda olan, uzunluğu yeddi metr olan.

**YEDDİMƏRTƏBƏ(Lİ)** *sif.* Yeddi mərtəbəsi olan, yeddiqat. *Yeddimərtəbə ev. Yeddimərtəbə bina.*

**YEDDİNCİ** "Yeddi"dən *sıra sayı. Yeddinci sıra. Yeddinci nömrə. Həftənin yeddinci günü.* – [Teymur] *yeddinci sinfi bitirib, sənət məktəbinə girmiş, oranı da müvəffəqiyyətlə bitirmişdi.* M.Hüseyn.

**YEDDİYAŞAR** *sif.* Yeddi yaşı olan. *Yeddiyaşar at.*

**YEDDİYAŞ(LI)** *sif.* Yeddi yaşı olan. *Yeddiyaşlı qız.*

**YEDƏK** *is.* 1. Heyvanı çəkib arxasınca aparmaq üçün boynuna və ya boyunduruğuna bağlanan ip. *İnəyi yedəyindən tutub çəkmək. – Hacı Rüstəm gəlib cəddinin payını istədi. Köç əhli etina eləmədi. Atının yedəyindən tutub, alaçıqları bir-bir gəzdi.* Ə.Haqverdiyev. ☐ **Yedəyə (yedəyinə) almaq** – ipindən tutub dalınca çəkmək; dalınca çəkib aparmaq. [Vəzir:] *Axırda atları yedəyimə alıb təpənin başına çıxdım!..* Çəmənzəminli. **Yedək vermək** – atı və ya başqa heyvanı ipindən tutub dalınca çəkmək. *Kələ, öküzə yedək vermək.*

2. Gəmini, qayığı sahilə, körpüyə bağlayan ip və ya zəncir. *Qayıq və gəmilərin yedəkləri dalğaların təsiri ilə gah gərilir, gah boşalırdı.* ☐ **Yedək ipi** – bir gəminin, maşının digərini çəkib aparması üçün onlara bağlanan ip (buraz, kanat və s.). **Yedək gəmisi (maşını** və s.) – 1) başqa gəmiləri (maşınları) yedəyində aparan kişi (maşın və s.); 2) yedəkdə gedən gəmi (maşın və s.).

3. Motorlu maşına qoşulan yük arabası. *Avtomobillərin dartıcı gücündən səmərəli istifadə etmək üçün avtomobil zavodları avtomobil yedəkləri buraxır.* Ə.Cəfərov.

4. **Yedəyində** şəklində *zərf* – arxasınca, dalısınca, yedəyindən tutaraq. *Kor Alı qulanlar da yedəyində tapdana-tapdana öz evinə gəldi.* "Koroğlu". *Nəzərəli hələ atını minməyib yedəyində çəkir.* C.Məmmədquluzadə. *Kəndi dolaşıram yedəyimdə at; İçimdə bir qüvvə əmr edir: yarat!* S.Vurğun.

◊ **Yedəyi əldən qoymamaq** *məc.* – bərk saxlamaq, əldən buraxmamaq, boş tutmamaq. [Namaz:] *Həsən kişinin yedəyini əldən qoymur.* Ə.Haqverdiyev. **Yedəkdə qalmaq** – hamıdan geridə qalmaq, axırıncı yeri tutmaq.

**YEDƏKCİL** *sif.* Yedəkdə getməyi sevən (qoşqu heyvanı haqqında).

**YEDƏKÇİ** *is.* 1. Heyvanı yedəyə alan və ya qayığı yedəkdə çəkən adam.

2. Yedək maşınında, traktora qoşulan maşında və s.-də işləyən adam.

**YEDƏKÇİLİK** *is.* Yedəkçinin işi, vəzifəsi.

**YEDƏKLƏMƏ** "Yedəkləmək"dən *f.is.*

**YEDƏKLƏMƏK** *f.* 1. İpindən tutub öz arxasınca çəkmək. *Atı yedəkləmək. – Bir azdan sonra bəyin də atını yedəkləyib gətirdilər.* M.Hüseyn.

2. Əlindən tutub öz dalınca aparmaq. *Üçüncüsü vaxtında müalicə etməyib göz ağrısından əbədi kor olmuş atasını yedəkləyirdi.* N.Nərimanov.

3. Bir yerindən tutub saxlamaq.

4. *məc. dan.* Bir işə qoşmaq, calamaq. *Uşaq bir az böyüyən kimi onu bir işlə yedəkləmək lazımdır.*

**YEDƏKLƏNMƏ** "Yedəklənmək"dən *f.is.*

**YEDƏKLƏNMƏK** *məch.* 1. Yedəyə alınmaq. // Cilovundan tutulmaq.
2. Bir yerindən tutulub saxlanmaq.
**YEDƏKLƏTMƏ** "Yedəklətmək"dən *f.is.*
**YEDƏKLƏTMƏK** *icb.* Yedəyə aldırmaq.
**YEDƏKLİ** *sif.* Bağlı, cilovlu, yedəkdə olan. *Yedəkli at.*
**YEDİRİLMƏ** "Yedirilmək"dən *f.is.*
**YEDİRİLMƏK** *məch.* Yem, yemək və s. verdirilmək; yedirdilmək.
**YEDİRMƏ** "Yedirmək"dən *f.is.*
**YEDİRMƏK** *f.* Bir başqasına yemək vermək, yeməklə təmin etmək. [Qızılquşun] *balaları yumurtadan çıxınca ovladığı quşları öldürüb qanını içər, sonra da qanı qusub balalarına yedirər.* A.Şaiq. *Fəqət bir hal* [Murada] *çox ağır gəlirdi: arvadının qazanıb onu yedirməklə bəsləməsi.* S.Hüseyn.
**YEDİRTMƏ** "Yedirtmək"dən *f.is.*
**YEDİRTMƏK** *icb.* 1. Yeməyə sövq və ya məcbur etmək; yedirmək.
2. Yemək vermək, yem vermək, dən vermək. *Heyvanları yedirtmək. Quşları yedirtmək. – Bizim Qızılı özümə alışdırmaq ümidi ilə hər gün nə qədər çörək yedirdimsə, yenə də alaçıqdan çıxıb bir yana getdiyimi görüncə .. boğuq səslə hürər, nəşəmi pozardı.* A.Şaiq.
3. Canına çəkdirmək, bir şeyi az-az bir şeyin içində həll etdirmək. *Yağı xəmirə yedirtmək.*
**YEDİZDİRİLMƏ** "Yedizdirilmək"dən *f.is.*
**YEDİZDİRİLMƏK** b a x **yedirilmək**.
**YEDİZDİRMƏ** "Yedizdirmək"dən *f.is.*
**YEDİZDİRMƏK** b a x **yedirmək**. *Nəbi burada Həcərlə dincəlir, onu savaşlardan salamat çıxardan Boz ata tumar verir, arpa əvəzinə kişmiş yedizdirirdi.* S.Rəhimov.
**YEFRÉYTOR** [*alm.* Gefreiter] Sıravi əsgərə verilən birinci hərbi rütbə və bu rütbəni daşıyan şəxs.
**YEGAH** *is.* [*fars.*] *mus.* Aşağı oktavanın birinci pilləsi.
**YEGAN** *is.* [*fars.*] Nərd oyununda – qoşa gələn təklər, cüt birlər.
**YEGANƏ** *is.* [*fars.*] Bir, bircə, tək, bir, yalnız, vahid. *Yeganə övlad. – İndi yeganə bir çarə varsa, o da müdara etmək və vaxt qazanmaqdan ibarətdir.* M.S.Ordubadi. *Oturmağa boş stulumuz olmadığından, qızlarım ayaq üstündə durub, yeganə pəncərəmizə söykənmişdilər.* M.Hüseyn. *Səmədin yeganə ümidi, istinadgahı Sultan idi.* İ.Hüseynov.
**YEGANƏLİK** *is.* Təklik, vahidlik, ancaq bir olma. *Urar ol həm yeganəlikdən dəm; Der ki: aləmdə hər nə var, mənəm.* Füzuli.
**YEGÉR** *is.* [*alm.*] 1. Ovçuluq təsərrüfatlarında ov haqqında qanuna nəzarət edən peşəkar ovçu.
2. Bəzi ordularda xüsusi nişançı polklarında xidmət edən əsgər.
**YEHAYE** *is. dan.* 1. Ardı kəsilmədən iştaha ilə yemə (çoxları haqqında). *Yehaye başlandı.*
2. *məc.* Hərə bir tərəfdən yemə, mənimsəmə, dağıtma; kütləvi rüşvətxorluq.
**YEXİDNA** *is. zool.* 1. Avstraliyada yaşayan kirpiyəbənzər heyvan.
2. Avstraliyada yaşayan zəhərli ilan.
**YEK** *say* [*fars.*] *klas.* Bir (adətən bir sıra mürəkkəb sifətlərin "bir", "tək" mənasında olan birinci tərkib hissəsi; məs.: yekdil, yekrəng).
**YEKBƏYEK** *zərf* [*fars.*]: **yekbəyek gəlmək** – üz-üzə gəlmək, müxalifət göstərmək, toqquşmaq, sözü düz gəlməmək. *Axı belə ağır bir zəmanədə böyüklərlə bu cür yekbəyek gəlmək yalnız ziyan gətirə bilər.* M.Hüseyn.
**YEKCƏHƏT** *sif.* və *zərf* [*fars.* yek və *ər.* cəhət] *klas.* Həmrəy, həmfikir, yekdil. *Mən yekcəhətəm təriqətimdə.* Füzuli. [Molla Vəli:] *Hamı yekdil, yekcəhət bu yolda qan tökməyə amadə olar.* Ə.Haqverdiyev. ◻ **Yekcəhət olmaq** *köhn.* – həmrəy olmaq, yekdil olmaq, bir olmaq, birləşmək. [Xanzadələr və bəyzadələr] *birləşib, yekdil və yekcəhət olub, ümumi məsələlər irəli yetirmək əvəzinə neçə-neçə firqəyə bölünüb bir-biri ilə büğz və ədavət başladılar.* F.Köçərli.
**YEKCƏHƏTLİK** *is. köhn.* Həmrəylik, həmfikirlilik, yekdillik. *Sənə ancaq yekcəhətlik və yekdillik lazımdır* [ki], *revolyusiya edib übudiyyətdən nicat tapasan.* M.F.Axundzadə.
**YEKCİNS** *sif.* [*fars.* yek və *ər.* cins] Eynicinsli, eyni cinsdən olan, eyni xarakterli, eyni keyfiyyətli, eyni tərkibli. *Yekcins cisim. Yekcins maddə.* // Xalis, saf, qatışığı olmayan.
**YEK-DİGƏR** [*fars.*] *köhn.* Bir-birini, bir-birinə, bir tərəf digər tərəfi (tərəfə). ◻ **Yekdigəri ilə** – bir-biri ilə.

**YEKDİL** *sif.* [*fars.*] Fikri, hissi, rəyi bir olan; həmrəy. *Yekdil qərar.* // Zərf mənasında. [Mirzə Həsən:] *Şura hökumətinin təkliflərini ürəkdən, yekdil, yekcəhət alqışlamalıyıq.* Ə.Haqverdiyev. □ **Yekdil olmaq** – fikri, rəyi, qərarı bir olmaq, həmrəy olmaq.

**YEKDİLLİK** *is.* Fikir, rəy birliyi; həmrəylik. *Yekdillik göstərmək.*

**YEKƏ** *sif.* 1. Həcmcə, boyca, cüssəcə böyük, iri. *Yekə daş. Yekə ağac. Yekə bədən.* – *Yekə başın faydası yoxdur, içində beyin gərək.* (Ata. sözü). *Ətrafdakı hər şey Səmədin nəzərində qeyb oldu, təkcə Məmiş Əlləzoğlunun yekə .. gövdəsi gözləri önündə dayandı.* İ.Hüseynov.

2. *məc*. Yaşlı, kamala çatmış, hər şeyi başa düşən. *Yekə oğlansan*. – [Asya Gülçöhrəyə:] *Sən yekə qızsan. Elə şeyləri başından çıxart. Sən hara, bazarın gedəsi hara..* Ü.Hacıbəyov.

◊ **Yekə yerdən danışmaq** – lovğalıq etmək, lovğa-lovğa danışıq. *Əlindəki badə olsun, saz olsun; Hərəkətin işvə olsun, naz olsun; Yekə yerdən danışmağın az olsun; Düşərsən bir dərin ah-vaya, Pəri!* Aşıq Məhəmməd bəy. **Başından yekə danışmaq** – yaşına, tutduğu mövqeyə, biliyinə yaraşmayan, uyğun olmayan sözlər danışmaq. *Tez ol! Çox danışma başından yekə; Yoxsa doğranarsan lap tikə-tikə.* S.Vurğun.

**yekə-yekə** *zərf* Böyük-böyük, iri-iri. [Pərinisə ərinə:] *..Eşşəyin üstə yekə-yekə çuvallar çatılmışdı*. C.Məmmədquluzadə.

◊ **Yekə-yekə danışmaq** – b a x **başından yekə danışmaq** (“**yekə**”də). [Qaraş:] *Mən ölüm Həsənəli, yekə-yekə danışma! Həyə sən kişi idin, binəva Süleyman bəyə vaxtında patron yetirə idin*. C.Məmmədquluzadə.

**YEKƏBAŞ** *sif.* 1. Başı böyük olan. *Yekəbaş adam*.

2. *məc*. Çətin qanan, höcət, kənək; qaba, mərifətsiz adam. *Gör yekəbaş, gönüqalın axmaq, malımı nə günə salıb!* Mir Cəlal.

**YEKƏBAŞLI** b a x **yekəbaş** 1-ci mənada.

**YEKƏBAŞLIQ** *is.* Qanmazlıq, qabalıq, kobudluq.

**YEKƏBIĞ(LI)** *sif.* Bığları yekə olan. *Sonra yekəbığlı, yoğunqarın bir fəhlə çıxıb danışdı.* Qantəmir.

**YEKƏBURUN** *sif.* Burnu yekə olan. *Yekəburun oğlan.*

**YEKƏBUYNUZ(LU)** *sif.* Buynuzları çox böyük olan, iribuynuzlu. *Yekəbuynuz öküz, maral.*

**YEKƏDALAQ(LI)** *sif.* Dalağı şişmiş (xəstə).

**YEKƏDIRNAQ(LI)** *sif.* Dırnaqları çox iri, yaxud çox uzun olan.

**YEKƏDİŞ(Lİ)** *sif.* Dişləri çox iri olan.

**YEKƏDODAQ** *sif.* Dodaqları böyük, enli olan. *Yekədodaq adam*.

**YEKƏDÖŞ(LÜ)** *sif.* Döşləri çox iri olan.

**YEKƏXANA** *sif.* Özünü hər kəsdən yüksək sayan, lovğa, təkəbbürlü, başqasını bəyənməyən.

◊ **Yekəxana danışmaq** – b a x **yekə-yekə danışmaq** (“**yekə-yekə**”də).

**YEKƏXANALANMAQ** *f.* Saymazyanalıq etmək, heç kəslə hesablaşmamaq, lovğalanmaq, özünü başqalarından yüksək tutmaq, təşəxxüslənmək, lovğa-lovğa danışmaq.

**YEKƏXANALIQ** *is.* Lovğalıq, təşəxxüs, özünü başqalarından yüksək tutma, başqalarını saymama. [Fərzəli:] *Bilmirəm heç sizə bu iddia, bu yekəxanalıq haradan belə gəlibdir.* S.Rəhimov.

**YEKƏXANA-YEKƏXANA** b a x **yekə-yekə**.

◊ **Yekəxana-yekəxana danışmaq** – b a x **yekə-yekə danışmaq** (“**yekə-yekə**”də).

**YEKƏXANALANMA** “Yekəxanalanmaq”-dan *f.is.*

**YEKƏQANAD(LI)** *sif.* Qanadları çox böyük olan.

**YEKƏQARIN** *sif.* 1. Qarnı çox yekə, iri olan. *Yekəqarın kişi.* – [Mirzə Həsən:] *O yekəqarın kulakla nə söhbət eləyirdin?* Ə.Haqverdiyev.

2. *məc.* Qarınqulu, doymaq bilməyən.

**YEKƏQAŞ** *sif.* 1. Qaşı enli və qalın olan, enliqaş (b a x **qaş** 1-ci mənada). *Yekəqaş adam.*

2. Qaşı böyük olan (b a x **qaş** 2-ci mənada). [Oğlan:] *Yəni burada, siz buyuran, ən əla, yekəqaş brilyant üzük .. vardır?* S.Rəhimov.

**YEKƏQULAQ(LI)** *sif.* Qulaqları çox böyük olan; palazqulaq.

**YEKƏQUYRUQ** *sif.* Quyruğu çox böyük olan; şələquyruq.

**YEKƏLƏNDİRİLMƏ** "Yekələndirilmək"dən *f.is.*

**YEKƏLƏNDİRİLMƏK** *məch.* Yekə hala salınmaq; iriləşdirilmək.

**YEKƏLƏNDİRMƏ** "Yekələndirmək"dən *f.is.*

**YEKƏLƏNDİRMƏK** *f.* Böyütmək, iriləşdirmək.

**YEKƏLƏNMƏ** "Yekələnmək"dən *f.is.*

**YEKƏLƏNMƏK** *f.* Yekə olmaq, iriləşmək. // Yaşa dolmaq, böyümək. *Uşaqlar daha yekələniblər.*

**YEKƏLƏTMƏ** "Yekələtmək"dən *f.is.*

**YEKƏLƏTMƏK** *f.* Daha yekə etmək, daha da böyütmək.

**YEKƏLİK** *is.* 1. Yekə şeyin halı; irilik, həcmcə böyüklük. *Daşın yekəliyi. Ayaqqabının yekəliyi. – Başın yekəliyi dövlətdir, ayağın yekəliyi neybət.* (Ata. sözü). *O yekəlikdə tayadan üç-dörd çəngə ot çıxır.* M.Hüseyn. [Qədir:] *Mən yekəlikdə adamın diriliyini danırlar.* Mir Cəlal.

2. B a x **yekəxanalıq**. *Mərd olan al geysə, yekəlik bilməz; Namərd şilə geysə, xanlıq davalar.* Molla Cümə.

**YEKƏLMƏ** "Yekəlmək"dən *f.is.*

**YEKƏLMƏK** *f.* Yekə olmaq, həcmcə, boyca artmaq. *Bağda ağaclar lap yekəlmişdir. Qarnı yekəlmək.* // Böyümək, yekələşmək. *Yaşar da ata-anasının və mülayim nənəsinin, bir də Səlimin məhəbbəti ilə boy atıb yekəlirdi.* S.Rəhimov.

2. *məc.* Qürurlanmaq, iftixar etmək (çox vaxt "dağ boyda", "dağ kimi" sözləri ilə). [Bazarbaşı:] *Mirzə canı, mən Hacı ağanı görəndə inan ki, dağ boyda yekəlirəm.* P.Makulu.

**YEKƏLTMƏ** "Yekəltmək"dən *f.is.*

**YEKƏLTMƏK** *f.* 1. Böyütmək, iriləşdirmək. // *məc.* Şişirtmək, böyütmək, yekə göstərmək. *Xırda məsələni yekəltmək lazım deyil.*

2. *məc.* Böyük tutmaq; qürrələnmək. *Özünü az yekəlt. – Aslan özü bilmədən özünü dartıb yekəltmək istədi.* S.Rəhimov.

**YEKƏPƏR** *sif.* və *is.* Çox yekə, çox iri, cüssəcə çox böyük. *Dəmirçioğlu baxdı ki, bu, bir yekəpər, kələ-kötür adamdı, üz-gözündən zəhm yağır.* "Koroğlu". *Mən onların yekəpər köpəyini göstərib: – O dinsizlərin öhdəsindən bu imansız gələr! – dedim.* M.Rzaquluzadə.

**YEKƏPƏRLİK** *is.* Yekəpər adamın (heyvanın) hal və görünüşü.

**YEKƏRAQ** *sif. köhn.* Böyüktəhər, bir qədər yekə, iri. // Çox yekə. *Hər kəsin olsa başında yekəraq əmmamə; Görünür xəlqdə guya ki, odur əllamə.* S.Ə.Şirvani.

**YEKƏSAQQAL** *sif.* Saqqalı yekə olan. *Yekəsaqqal kişi.*

**YEKƏYANAQ(LI)** *sif.* Yanaqları çox yekə, ətli olan.

**YEKNƏSƏQ** *sif.* [*fars.*] 1. Eyni ilə bir-birinə oxşayan, eyni tərzdə, eyni şəkildə olan, eyni cür səslənən, bir-birindən qətiyyən ayrılmayan; yekrəng. ..*İçəridən* [Mehribanın] *yeknəsəq və zil səsi eşidildikdə Zeynalın sanki vücudunu titrətdi.* S.Hüseyn. *Hətta Atabəy elə düşünürdü ki, yekrəng və yeknəsəq libaslar da Atabəyə xidmət edən qadınlar üçün xüsusi olaraq tikdirilmişdir.* M.S.Ordubadi.

2. *məc.* Usandırıcı, darıxdırıcı, bıqdırıcı, cansıxıcı. *Yeknəsəq iş. – Kompressor stansiyasından gələn yeknəsəq gurultunun arası kəsilmirdi.* M.Hüseyn. *O, çayxananın yeknəsəq, sakit və ölgün bir adiliklə damğalanmış həyatına hərəkət və canlılıq gətirmiş müsafirləri razı salmağa çalışırdı.* M.İbrahimov.

**YEKNƏSƏQLİK** *is.* Yeknəsəq şeyin hal və keyfiyyəti; yekrənglik. *Musiqinin yeknəsəqliyi. Həyatın yeknəsəqliyi.*

**YEKPAY** *zərf* [*fars.*] Aşıq havalarından biri. *Aşıq Səfər yekpay oxuyur. Yekpaydan sonra balabançı əyləşir.* Ə.Haqverdiyev.

**YEKPARƏ** *sif.* [*fars.*] 1. Tam, bütün, bütöv, bir parçadan ibarət olan; monolit. *Yekparə qaya. – Böyük daş parçalarından tikilmiş və ya yekparə* (*monolit*) *daşlardan qurulmuş qədim abidələrə meqalitin abidələr deyilir.* Ə.Salamzadə.

2. *məc.* Vahid, parçalanmaz, bütöv.

**YEKRƏNG** *sif.* [*fars.*] 1. Eyni rəngdə olan, rəngi bir olan, bir-birinə oxşayan.

2. Bir cür, eyni. *Mən yenə də, həmişə olduğu kimi, ona sadə və yekrəng cavablar verdim.* M.S.Ordubadi.

3. *məc.* Cansıxıcı, maraqsız, yeknəsəq. [İblis:] *Öylə yekrəng olaraq keçsə həyat; Bıqar insan, yaşamaqdan yorular.* H.Cavid. *Uşaqlıqdan qəlbimin dərinliklərində iz salmış yekrəng olmayan, o qiymətli və silinməz xatirələr!..* A.Şaiq.

**YEKRƏNGLİK** *is.* 1. Yekrəng şeyin hal və keyfiyyəti. *Torpağın yekrəngliyi.*

2. *məc.* Cansıxıcılıq, maraqsızlıq, yeknəsəqlik. *Həyatın yekrəngliyi. Musiqinin yekrəngliyi.*

**YEKSAN** *sif.* [*fars.*] *klas.* Düz, bərabər, tən. *Onunçun var yalnız bircə səadət; O səadət məhəbbətlə yeksandır.* A.Səhhət.

◊ **Yer (torpaq, xak) ilə yeksan etmək** – büsbütün dağıtmaq, yerlə bir eləmək. *Mən sülhə səs verirəm; Qədim abidələri; Yerlə yeksan etməsin; Toplar bir an içində.* H.Hüseynzadə. **Yer (torpaq, xak) ilə yeksan olmaq** – tamamilə yıxılıb dağılmaq, yerlə bir olmaq. *Bir deyən olmadı, ey xanəxərab; Məmləkət xak ilə yeksan oldu.* M.Ə.Sabir; // məhv olmaq. *Vallah, elə bəd dua elərəm ki, yerlə yeksan olarsan!* C.Məmmədquluzadə.

**YEKSƏR** *sif.* [*fars.*] Başdan-başa, bütün, hamı, tamam. *Sən o deyildinmi, edəndə qiyam; Səcdə edərdi sənə yeksər əvam?* M.Ə.Sabir. [Şeyx Kəbir Sənana:] *Cahil-arif, böyük-kiçik yeksər; Səni özlər, sevər, pərəstiş edər.* H.Cavid. *İtirdi özünü soldatlar yeksər; Atıldı uçruma o dəmdə Əjdər.* H.K.Sanılı.

**YEKTA** *sif.* [*fars.*] *köhn.* Tayı-bərabəri olmayan, nadir, yeganə, vahid.

**YEKTƏRƏF** *sif.* [*fars.* yek və *ər.* tərəf] Birtərəfli, məhdud.

**YEKUN** *is. müh.* Bir neçə ədədin cəmindən əldə edilən say, hesabın məcmusu. // *məc.* Bir şeyin nəticəsi. *Xalq təsərrüfatı inkişafının yekunları. İşin yekunları.* ☐ **Yekun vurmaq** – 1) b a x **yekunlaşdırmaq**. *Gəlirin yekununu vurmaq;* 2) son vermək, tamamlamaq. *Şəmsi yenə vaxtın azlığını xatırlayıb söhbətə cırıq dəftərnən məhkəmə quracağam! – deyə yekun vurmağa çalışdı.* M.Hüseyn. *Mən bu* [Abbas əmi] *təhkimçi ilə söhbətinə yekun vurmuşdum.* İ.Hüseynov. **Yekun vurulmaq** – b a x **yekunlaşdırılmaq**.

**YEKUNLAŞDIRILMAQ** *məch.* 1. Yekun vurulmaq, yekunu çıxarılmaq, cəm edilib hasili əldə edilmək. *Həftənin axırında şərbafların işlədiyi muzd və apardıqları nisyə ayrı-ayrı yekunlaşdırılır*(*dı*). Ə.Əbülhəsən.

2. *məc.* Nəticə çıxarılmaq, xülasə edilmək. *İclasda çıxış edənlərin mülahizələri yekunlaşdırıldı.*

**YEKUNLAŞDIRMA** "Yekunlaşdırmaq"-dan *f.is.*

**YEKUNLAŞDIRMAQ** *f.* 1. Ədədləri üst-üstə gələrək cəmini tapmaq, ümumi məbləği hesablamaq; cəmləşdirmək. *Gəlir cədvəlini yekunlaşdırmaq.*

2. *məc.* Nəticələrini müəyyənləşdirmək, ümumiləşdirmək, ümumi nəticə çıxarmaq. "*Ölülər*" *C.Məmmədquluzadənin din, mövhumat və feodal həyat tərzi əleyhinə mübarizəsini əks etdirən və bu mübarizəni yekunlaşdıran bir əsərdir.* M.İbrahimov.

**YEKVÜCUD** *sif.* [*fars.*] *köhn. kit.* Vahid, bir, yekparə. *Mənə qarşı hər bir hədyan söyləyəcəklərsə söyləsinlər, lakin məni bəhanə edib də, yekdil və yekvücud olması lazım gələn millətimizin içinə qarabağlı və bakılı kimi fitnəəngiz məsələlər salmasınlar.* Ü.Hacıbəyov.

**YEL**[1] *is.* 1. Külək. *Yaman yel əsir. İsti yel. Bu gün bərk yel var. – Şirmayı telə işlər; Dəyirman yelə işlər; Heç nəfərin başına; Gəlməsin belə işlər.* (Bayatı). *Müştaqdır gözünə aləmin gözü; Yel atar çarqatın, açılar üzü.* Q.Zakir. ☐ **Yel vurmaq** – küləkdən xarab olmaq, azar döymək, zaval vurmaq. *Bu il bitkiləri yel vurmuşdur.* **Yelə vermək** – 1) qurumaq, yaxud iyi, tozu getmək üçün havaya vermək. *Paltarları yelə vermək. Yorğan-döşəyi yelə vermək;* 2) sovurmaq. *Sünbülü yelə verib dənini samandan ayırmaq;* 3) *məc.* israf etmə, dağıtmaq, puça çıxarmaq; bada vermək. *Bütün varını yelə vermək. – Ömrümüzün altı illik gül tacını yelə verən; Darülfünun nə öyrədir, səfalətdir maarifimiz.* Şəhriyar.

2. Mədə və bağırsaqlarda əmələ gələn qaz.

3. *məc.* İtilik, sürət mənasında (adətən tərkiblərdə). *Uzaqlaşan kimi atların yeli öz-özünə yatdı.* S.Rəhimov. *Haydı, minib belinə yel gedişli atların; Yerdə, göydə, dənizdə oynasın qanadların.* M.Müşfiq. ☐ **Yel atına minmək** – iti yerimək, yeyin yerimək. **Yel kimi, yeltək** – çox sürətlə, çox iti. *Yel kimi qaçmaq. – Oğlan atın üstünə minib, onu məhmizlədi. At yel kimi uçurdu.* (Nağıl). *Dönübdür gənc Osman qanadlı quşa; Yel kimi dırmaşır o, dik yoxuşa.* H.K.Sanılı. *Qıy vurub tərlanım yeltək keçəndə; Bir vəlvələ düşür hər yana, dağlar!* S.Vurğun. **Yel kimi gəzmək** – veyillənmək, boş-boş gəzmək, avaralanmaq.

*Hərzədir yel kibi gəzmək, nə bitər avarədən?* Nəsimi.

◊ **İçində yel gəzib, yengələr oynamaq** – bax **yerində yellər əsmək**. *İş belə gedərsə, Gəray ağanın Qarabağ düzənlərindəki malikanəsi, Şuşa şəhərindəki üçmərtəbəli imarəti də xaraba qalacaq, sökülüb-töküləcək, içində yel gəzib, yengələr oynayacaqdır.* S.Rəhimov. **Yel olub yanından (yanımdan) ötə də bilməz** – hədəyə qarşı cavab ifadəsi. [İmamqulu:] *Sən öləsən, heç yel də olub yanımdan ötə bilməzsən.* N.Vəzirov. **Yerində yellər əsmək** – nam və nişanı qalmamaq, məhv olmaq.

**YEL²** *is.* Revmatizm xəstəliyinin xalq arasında adı. *Qıçlarımı yel tutub. – Əl-ayağını yel tutan xəstəni isə Qalaya* (*Pirvəro*) *aparardılar.* H.Sarabski.

**YELAPARDI** *is. məh.* 1. Sac üstündə bişirilən nazik, yağlı yuxa. *Yelapardını sac üzərində bişirərlər.*

2. Çox yüngül, nazik şey haqqında. *Bu çit lap yelapardı çitdir.*

**YELAYAQ(LI)** *sif.* Yeyin yeriyən, çox iti gedən. *Çəkirlər əllərimi qupquru damar-damar; Ey uzunsaç rəssamlar, yelayaq fotoqraflar.* S.Rüstəm.

**YELBEYİN** *sif.* və *is.* Başıboş, axmaq, gic, səfeh; yüngül. *Yelbeyin adam. – Birisi ona övliya, o birisi ona yelbeyin, birisi ona əzim, o birisi ona vəzir, birisi ona ağıllı, o birisi ona tamam dəli adını verirdi.* S.Rəhimov.

**YELBEYİNCƏSİNƏ** *zərf* Yelbeyin adama yaraşan bir tərzdə; axmaqcasına, səfehcəsinə. *Yelbeyincəsinə hərəkət etmək.*

**YELBEYİNLİK** *is.* Başıboşluq, giclik, axmaqlıq, səfehlik, yüngüllük, axmaqcasına hərəkət. *Yelbeyinlik etmək.*

**YELBƏ** *is. zool.* Çox iti yeriyən balaca köçəri quş. *Dağa yelbə nə lazım; Girər qəlbə, nə lazım; Ağacda bar olmasa; Ona səlbə nə lazım.* (Bayatı). □ **Yelbə kimi** – çox iti, çox tez, çox yeyin. *Yelbə kimi getmək. Bu at yelbə kimi qaçır.*

**YELBİZ** *is. məh.* Qadın saçı.

**YELBİZLƏMƏ** "Yelbizləmək"dən *f.is.*

**YELBİZLƏMƏK** *f. məh.* Yelbizindən yapışmaq, saçından yapışmaq.

**YELBİZLƏNMƏ** "Yelbizlənmək"dən *f.is.*

**YELBİZLƏNMƏK** *məch. məh.* Yelbizindən tutulmaq, saçından tutulmaq.

**YELCÖVÜZÜ** *is.* Təbabətdə, ətriyyat işlərində, yaxud ədviyyə kimi işlənən bitki meyvəsi.

**YELÇƏKƏN** *is.* 1. Qapalı binada qarşı-qarşıya olan açıq yerlərdən gələn hava cərəyanı. *Yelçəkəndə oturmaq. Bura yaman yelçəkəndir.*

2. Qapalı binanın havasını dəyişdirmək üçün qurğu; ventilyasiya, ventilyator. *Yelçəkən xarab olub, işləmir.*

**YELÇÖPÜ** *is. məh.* Çiçəksiz bir bitki adı.

**YELDA** 1. *is.* [*fars.*] *klas. şair.* Dekabr ayının 21-nə təsadüf edən ən uzun gecə (çox vaxt "şəbi-yelda – yelda gecəsi" tərkibində işlənir). *İldə bir yelda gəlir ayinü rəsmidəhrdə; Bu nə yeldadır gəzir ayın yanınca müttəsil?* Q.Zakir. *Dilqəməm, qarşıma çıxdı xuraman; Bir şəbi-yeldadə bir mahitaban.* Aşıq Dilqəm.

**YELDƏYİRMANI** *is.* Küləyin hərəkətə gətirdiyi pərlər vasitəsilə işləyən dəyirman. *Arxa planda su quyusu üstündə hərəkətsiz dayanmış yeldəyirmanı.* Ə.Məmmədxanlı.

**YELƏK** *is.* 1. Lələk.

2. *məh.* Oxun baş tərəfinin enli hissəsi. *Oxun yeləyi olmayanda yerə tez düşər.* Xəstə Qasım.

3. *məh.* Qolsuz gödək paltar.

**YELƏKLİ** *sif.* Yeləyi olan.

**YELƏKSİZ** *sif.* Yeləyi olmayan. *Bir iyidin dünya varı olmasa; Yeləksiz ox kimi çovar deyərlər.* Xəstə Qasım.

**YELƏN** *is.* Haşiyə, qıraq, kənar. *Xalça yeləni. Yeləni göy kəlağayı. – Asılır evlərin divarlarından; Yeləni çiçəkli, güllü xalılar.* O.Sarıvəlli. // Bütöv bir parçanın qırağına çəkilən başqa bir parça; calaq. *Yorğan yeləni.* □ **Yelən vermək** – qırağına calaq salmaq. **Yelən qoymaq** – kağızı yazanda dörd kənarını yazmayıb ağ qoymaq. **Yelən çıxmaq** – haşiyə çıxmaq.

**YELƏNCİRİ** *is.* Varəncir, badəncir.

**YELƏNLİ** *sif.* Yeləni olan, haşiyəli.

**YELƏNSİZ** *sif.* Yeləni olmayan, haşiyəsiz.

**YELGƏ** *is. məh.* 1. Qadın saçı.

2. At yalı.

**YELİN** *is.* Məməli heyvanlarda süd yığılan (süd vəziləri və məmələri yerləşən) orqan. *Bu inəyin yelinində süd çoxdur. – Salxım-salxım olacaqdır ağ üzümü tənəklərin; Yelinləri dolacaqdır yenə sağmal inəklərin.* S.Vurğun. *Yelini südlə dolu qoyunlar ağıllardakı quzuların mələşməsini eşitdikcə daha yanıqlı bir səslə onlara hay verərək, yatağa çatmağa tələsirdi.* M.İbrahimov. ◻ **Yelin salmaq** – yelini böyümək (doğmağa bir neçə gün qalmış heyvanın). *Boz inək yelin salıb.* **Qızıl (qırmızı) yelin** – boğaz inək. [Qədim:] *Xırda, bir sən o qırmızı yelini görürsənmi?* S.Rəhimov.

**YELİNLƏMƏ** "Yelinləmək"dən *f.is.*

**YELİNLƏMƏK** *f.* Yelini südlə dolmaq. *İnəklər naxırdan qayıdınca yelinləyir.* // Doğmağa yaxın heyvanın yelini böyümək, südlə dolmaq. *İnək yelinləyib, bu gün-sabah doğacaq.*

**YELİNSOY** *is. məh.* Məməli heyvanlarda yelin xəstəliyi.

**YELKƏN** *is.* 1. Dor ağacına bənd edilən və içinə yel dolduğu zaman gəmini, qayığı hərəkət etdirən xüsusi biçimli qalın, möhkəm bez parçası. *Gəminin yelkənlərini açmaq, yığmaq.* ◻ **Yelkən açmaq (qaldırmaq)** – yelkənləri açıb hərəkət etmək, yola düşmək. *Dərviş olan gedər, gəzər dərində; Yelkən açar dayazlarda, dərində.* Aşıq Ələsgər. **Yelkən gəmisi** – yelkənlə hərəkət edən (motorsuz) gəmi (qayıq). **Yelkən çəkmək** – b a x **yelkən açmaq**. *Tez olun, yelkən çəkin, düşək yola.* **Yelkənləri endirmək** – hərəkət edən gəminin sürətini azaltmaq və ya saxlamaq.

2. Üstünə tut və b. xırda meyvələri çırpmaq üçün iri bez parçası. *Tutu yelkənə çırpmaq.*

3. Badban, çərpələng. *Yelkən uçurtmaq.*

◊ **Yelkəni suya salmaq (vermək)** – təslim olmaq.

**YELKƏNLİ** *sif.* Yelkəni olan, yelkənlə hərəkət etdirilən. *Yelkənli gəmi. – Dənizdə gəzişən ağ yelkənli qayıqlar nəzəri cəlb edirdi.* S.Hüseyn. *Yelkənli gəmitək üzür göydə Ay; Qaraqoyunludan keçən Əyriçay; Əks edir köksündə güzgütək onu.* H.K.Sanılı. *Sahil boyu düzülmüş fənərlərin əksi dənizdə gəzən yelkənli qayıqları işıqlandırdı.* S.Rəhman.

**YELKƏNSİZ** *sif.* Yelkəni olmayan. *Mənsiz kətan, kəndir verməz zəmilər; Çadırsız, yelkənsiz* (z.) *qalar gəmilər.* A.Səhhət.

**YELQOVAN[1]** *is.* 1. *bot.* Toxumu külək vasitəsilə uzaqlara aparılıb, orada tökülən bir bitki və onun dəni; süpürüm. *Həsi və o biri rəncbərlər xırmanda eşələnir, saman içindən yelqovanları çıxarırdılar.* S.Rəhimov.

2. *məc.* Fikrində və işində sabit olmayan adam haqqında. *Yelqovanın biridir, onun sözünə etibar yoxdur.*

**YELQOVAN[2]** *is.* 1. Uzun ağacın başına bənd edilmiş və küləyin əsdiyi tərəfə çevrilərək onun istiqamətini göstərən dəmir lövhəcik və s.

2. *dan.* Saatın, dəqiqələri göstərən uzun əqrəbi.

**YELLƏDİLMƏ** "Yellədilmək"dən *f.is.*

**YELLƏDİLMƏK** "Yellətmək"dən *məch.*

**YELLƏMƏ** "Yelləmək"dən *f.is.*

**YELLƏMƏK** *f.* 1. Sərinləmək üçün bir şeylə havanı hərəkətə gətirmək, hava cərəyanı yaratmaq. *Yelpiclə üzünü yelləmək. – Rüstəm kişi hirsindən şapkasını çıxardı, üzünü yellədi.* M.İbrahimov.

2. Odu, ocağı alışdırmaq, kömürü közərtmək üçün üzərində havanı bir şeylə hərəkətə gətirmək, yel vermək; körükləmək. *Manqalı yelləmək.*

3. Yırğalamaq, tərpətmək, silkələmək, əsdirmək, yaxud itələmək, itələyərək o yana-bu yana hərəkət etdirmək. *Layla-layla deyə çəkər keşiyin; Min məhəbbətlə yelləyər beşiyin.* M.Ə.Sabir. *Bürcəliyev də Kərimqulu kişi kimi qaraldı, əllərini kənara yellədi.* S.Rəhimov. *Rüstəm kişi .. paltosunun ətəyini yelləyə-yelləyə* (z.) *özünü maarif idarəsindən çölə atdı.* M.İbrahimov.

4. Sürüb aparmaq. *Dan yerinə şəfəq düşmüşdü, malları yellədim, gün çıxar-çıxmaz evə gəldim.* A.Divanbəyoğlu.

5. Yelə vermək, tozunu çırpmaq. *Palazı yelləmək.* // Sovurmaq.

6. *məc. dan.* Bir işə təhrik etmək; qızışdırmaq.

**YELLƏNCƏK** *is.* Ağac budağından və ya bir yerdən asılmış müvazi qalın kəndirlərin ucuna bənd edilmiş oturacağı olan yellənmə qurğusu; salıncaq, uçuncaq. *Oğlan-qızla dolu uçuncaqlar, yelləncəklər havada fırlanırdı.*

S.Rəhimov. *Qızlar isə tək-tək yelləncəyə minir, havalanırdı.* Ə.Əbülhəsən.

**YELLƏNCƏKLİ** *sif.* Yelləncəyi olan, yellənmək üçün qurğusu olan.

**YELLƏNDİRİLMƏ** "Yelləndirilmək"dən *f.is.*

**YELLƏNDİRİLMƏK** *məch.* 1. Yelin təsiri ilə hərəkətə gətirilmək.

2. *məc. dan.* Bir işə təhrik edilmək; qızışdırılmaq.

**YELLƏNDİRMƏ** "Yelləndirmək"dən *f.is.*

**YELLƏNDİRMƏK** *f.* 1. Tərpətmək, əsdirmək, o yan-bu yana hərəkət etdirmək, yırğalandırmaq, dalğalandırmaq. *Yel ağacları yelləndirir. – Külək vurduqca Tellinin qıyğacı örtdüyü çadrasını yelləndirirdi.* S.Hüseyn.

2. *məc. dan.* Bir işə təhrik etmək; qızışdırmaq.

**YELLƏNMƏ** "Yellənmək"dən *f.is. Çar təbəələri və çar himayəsində olanların qapılarında çar bayraqlarının yellənməsi konsulun Təbrizə daxil olmasını bildirdi.* M.S.Ordubadi.

**YELLƏNMƏK** *f.* 1. Yelləncəyə minib o yan-bu yana hərəkət etmək. *Yelləncəkdə yellənmək.*

2. Tərpənmək, yırğalanmaq. *Beşik baxmaz heç bir kəsə; Qulaq verir gələn səsə; Nənə bir nəğmə söyləsə; Yel olur, yellənir beşik.* Ə.Cavad. // Dalğalanmaq, əsmək. [Qızıl Ordunun] *başı üstündə həqiqi azadlığın əbədi rəmzi olan qızıl bayraqlar yellənirdi.* M.İbrahimov.

3. *məc.* Avaralanmaq, veyillənmək, boş-boş gəzmək. *Bikar-bikar yellənib gəzir.*

4. Yel buraxmaq.

◊ **Yellənib uçmaq** – ruhlanmaq, bir yerə getməyə can atmaq. [Şərəfnisə xanım Şahbaz bəyə:] *Firəng qızları başlarına örtən təsəklər mənə lazım deyil, al Parijdə onların başlarına ört ki, Qarabağdan onların havasına yellənib uçursan.* M.F.Axundzadə.

**yellənə-yellənə** *zərf* 1. Yellənərək, dalğalanaraq. *Sürəkdən qurtarmış körpə maraltək; Saçları dağınıq, əlində ətək; Yellənə-yellənə gəlir qaçaraq.* H.K.Sanılı. *Qızın saçları, uzun hörüklərlə topuğa sarı; Yellənə-yellənə dalğalanırdı.* S.Vurğun. *Qara kişi artıq dayanmadı, ətəkləri yellənə-yellənə idarədən çıxdı.* Ə.Əbülhəsən.

2. *məc.* Nazlana-nazlana, əzilə-əzilə, naz-qəmzə ilə. *Yellənə-yellənə gələn yar.*

**YELLƏNTİ** *is. məh.* Yüngül yel. *İlin .. ən isti və ən odlu vaxtı idi. Nə bir kölgə, nə də .. bir yellənti vardı.* Ə.Əbülhəsən.

**YELLƏTMƏ** "Yellətmək"dən *f.is.*

**YELLƏTMƏK** *icb.* Yellənməyə məcbur etmək; yelləndirmək. *Çay aşağı getmərəm; Çadramı yellətmərəm; Xoruzgöz oğlan gərək; Dul kişiyə getmərəm.* (Bayatı). *Qaragöz tez küncə qaçıb ucları alaçığın iki tərəfində bərkidilib asılmış balaca nənnini yellətdi.* M.İbrahimov. *Əsən külək Gülşənin saçlarına sığal çəkir, güllü-çiçəkli paltarını yellədirdi.* Ə.Vəliyev.

**YELLİ[1]** *sif.* 1. Küləkli. *Yelli hava. Yelli bir gün.*

2. *məc. dan.* Hirsli, tünd, tez qızan. *Yelli adam.*

3. *zərf* Bərk, iti, şiddətli. *Oğlan çox yelli gəlir. – Kabinetin qapısı bir qədər yelli açıldı..* S.Rəhimov.

**YELLİ[2]** *sif. dan.* Yel xəstəliyi olan; revmatik. *Yelli qıçlar.*

**YELMAR** *is.* Çox iti gedən sarı-qırmızı rəngdə zəhərli ilan.

**YELPAZƏ** b a x **yelpik**. *Balkonun iki tərəfində duran xidmətçilər tavandan asılmış böyük yelpazəyə hərəkət verir.* M.S.Ordubadi. // Yelpik kimi açılıb qapanan. *Qadir .. günün batdığı yerdə yelpazə kimi açılıb göyün bir bucağını tutan qızılı şəfəqlərə diqqət etdi.* Ə.Əbülhəsən.

**YELPAZƏLƏMƏ** "Yelpazələmək"dən *f.is.*

**YELPAZƏLƏMƏK** *f.* 1. Yelpazə ilə yelləmək; yelpikləmək.

2. *məc.* Oxşamaq, nəşələndirmək. *Arabir qulaqlarımıza çarpan musiqidar fısıltılar qəlbimizi yelpazələyərək, bizdə nə qədər xoş təsir və canlı duyğular oyadır.* A.Şaiq.

**YELPAZƏLƏNMƏ** "Yelpazələnmək"dən *f.is.*

**YELPAZƏLƏNMƏK** *məch.* Özünü yelpazə ilə yelləmək, özünü yelpikləmək.

**YELPƏNƏK** *məh.* Xiyar. *Ağzı bir çuval, boynu şam piyi; Başı gərmək, burnu yelpənək.* Ü.Hacıbəyov.

**YELPİK** *is.* Sərinlik, yaxud ocağı alışdırmaq üçün yellətməklə havanı hərəkətə

gətirən alət. *Qatlama yelpik. Düz yelpik. Yelpiklə üzünü yellə. Ocağı yelpiklə yelləmək.* – *İki qız* [şahın] *başı üstündə oturub tovuz quşu qanadından qayrılmış yelpiklə onu yelpikləyirdi.* M.S.Ordubadi.

**YELPİKLƏMƏ** "Yelpikləmək"dən *f.is.*

**YELPİKLƏMƏK** *f.* Yelpiklə yelləmək, yelpiklə yelləyib sərinlik yaratmaq. [Sarı] *bir an içində yelpikləyib kömürü közərtdi və samovara od saldı.* S.Rəhimov.

**YELPİKLƏNMƏ** "Yelpiklənmək"dən *f.is.*

**YELPİKLƏNMƏK** 1. *qayıd.* Sərinlənmək üçün özünü yelpiklə yelləmək.

2. *məch.* Yelpiklə yellənmək.

**YELPİKLƏTMƏ** "Yelpiklətmək"dən *f.is.*

**YELPİKLƏTMƏK** *icb.* Yelpiklə sərinlətmək.

**YELPİKŞƏKİLLİ** *sif.* Yelpik şəklində olan.

**YELPİKVARİ** *sif.* Yelpiyə oxşayan, yelpik şəklində olan, yaxud yelpik kimi açılıb bükülən.

**YELPİNC, YELPİC** b a x **yelpik**. *Yelləyir körpə ağaclar bizi yelpic sayağı.* S.Rüstəm. *Günəş yerləri atıb gedərkən, üfüqlərdə sarı bir yelpic kimi açılmış şüalarını yığarkən mən onu düşünərdim.* Ə.Məmmədxanlı.

**YELSUYU** *is. məh.* Yerdən çıxan isti mineral suların xalq arasında adı.

**YELTƏNMƏK** *f. dan.* Çalışmaq, can atmaq. *Əlindən .. iş gəlməyən bu adam .. dərs verməyə yeltəndisə də, ondan da bir şey çıxmadı.* S.Rəhman.

**YEM** *is.* 1. Heyvanlara verilən yeyəcək (arpa, ot, saman və s.). *Qidalı yemlər. Şirəli yem. Siloslanmış yem.* – *Qara atları tövləyə çəkib yem verdi.* (Nağıl). *Yem gətirib yoxsa sizə verməyə? Ya ki gəlib bir quru dindirməyə?* A.Səhhət. *Kişi axurda yem yeyən atlarını göstərib fəxr edirdi*. Mir Cəlal. // Quşlara verilən dən və s. *Toyuqlara yem vermək. Quş yemi.*

2. Quş və heyvanı cəlb etmək üçün tələyə, cələyə, duzağa qoyulan yeyəcək şey. *Tələ yemi.* ☐ **Balıq yemi** – qarmağa taxılan soxulcan və s.

3. *məh., xüs.* Əl üsulu ilə daş çıxırarkən pazla daşın arasına qoyulan quru ot.

◊ **Yemi artıq düşmək** – qudurmaq, həddini azmaq.

**YEMÇİ** *is.* Kolxozda, sovxozda heyvanlara yem vermək və ya yem hazırlamaqla məşğul olan işçi.

**YEMÇİLİK** *is.* Heyvanlar üçün yem hazırlamaqla məşğul olma, yem yetişdirmə işi. // Sif. mənasında.

**YEMDOĞRAYAN** *is. xüs.* Heyvanlara veriləcək yemi doğrayan maşın.

**YEMƏ** "Yemək"dən *f.is.*

**YEMƏK** *f.* 1. Qida qəbul etmək, ağızda çeynəyib udmaq. *Xörək yemək. Meyvə yemək.* – *Yeyərsən qaz ətini, görərsən ləzzətini.* (Ata. sözü). *Xudayar bəy yeyib qarnı tox, .. arxayın və rahat uzanıb yatdı.* C.Məmmədquluzadə. [Mirzağa] *ata və anası ilə bir evdə yaşayır, bir süfrədə yemək yeyir, onlarla bərabər yatıbdururdu*. S.Hüseyn. // *İs. mənasında.* İnsanın müəyyən vaxtlarda yediyi şey; taam, xörək. *Yemək yemisinizmi? Hələ yemək yeməmişik. Sabah yeməyi* (*səhər yeyilən şey*). *Axşam yeməyi* (*axşam yeyilən şey, şam*). – *Heç düşünməz nadir yemək, uyqu; Gecə ulduzla, Ayla söhbət edər; Düşünür daima sabaha qədər.* H.Cavid. ☐ **Yemək masası (stolu)** – üstündə yemək yeyilən stol. *Usta əlindəki gül dəstəsini yemək masasının üstünə atdı..* M.Hüseyn. **Yemək otağı** – yemək yeyilən otaq, yemək yeyilmək üçün ayrılmış otaq. *Zeynal geniş bir şüşəbəndi keçib yemək odasına girdi*. S.Hüseyn. *Yemək otağına sükut çökmüşdü. Arabir çay içənlərin marçıltısı eşidilirdi.* Ə.Vəliyev.

2. Yemək, ruzi. [Qatama] *Qanqın şimalına doğru yürüyərək hər yerdə sehr göstərib yeməyini təmin edirdi*. Çəmənzəminli.

3. *dan.* Sancmaq, dişləmək. *Qollarımı başdan-başa ağcaqanad yeyib*.

4. Aşındırmaq, oymaq, dağıtmaq. *Su sahili yeyib dağıdır. Dəmiri pas yeyir. Qələvi dəriyə aşındırıcı təsir edir, onu yeyir*. // Gəmirərək, içindən yeyərək xarab etmək, korlamaq, pozmaq, dağıtmaq. *Xalçanı güvə yeyib. Meyvələri qurd yeyib.*

5. *məc.* Üzmək, əldən salmaq, rahat buraxmamaq. *Xəstəlik bədənini yeyir.* – *Yad gördü, dedi məni; Dərd oydu, yedi məni; Vəfasıza sirr verdim; Aləmə dedi məni.* (Bayatı). *Şamil ali təhsilini bitirib gəlincə təhsil də onu yeyib bitirmişdi.* A.Şaiq.

6. *məc. dan.* Heç bir imkan verməmək, dözülməz şərait yaratmaq, gözümçıxdıya salmaq, yaşamağa, çalışmağa qoymamaq. // *məc.* Yox etmək, məhv etmək. *Naçalnik elə bir halətdə mənim üzümə baxırdı ki, deyirdim, bu saat məni yeyəcək.* C.Məmmədquluzadə. [Qacar:] *Çox da təriflǝmə mənə vətəni; Bu qılınc olmasa, yeyərlər məni.* S.Vurğun. *Elə bil ev qurd olub* [Durnanı] *yemək istəyirdi.* Ə.Vəliyev. // Məhv etmək, qırıb tökmək. *Çəyirtkə taxılı yedi.*

7. *məc. dan.* Həyasızcasına mənimsəmək, alıb verməmək. *Özgənin malını yemək. – Dəstədə olan adamların biri Mir Qasımdır ki, doğma bacısı Səkinənin malını yemək qəsdi ilə saxta kağız düzəltmişdi.* C.Məmmədquluzadə. [Məşədi İbad:] *..Özü də hələ mənim beş min manat pulumu yeyibdir.* Ü.Hacıbəyov.

8. *məc. dan.* Məruz qalmaq, uğramaq. *Şillə yemək. Kötək yemək. – Molla əvvəlcə vermək istəmədi, bir neçə aynalı dürtməsi yeyəndən sonra, sandığın ağzını açdı.* "Qaçaq Nəbi". *Yarəb, ol qəmzən oxun bin yerdən artıq yemişəm.* Nəsimi. *Əhməd onu təhdid və təqib edirdi. Sağ böyründən bir qurşun yemişdi.* A.Şaiq. // *məc.* Dözmək, dözərək cavab verməmək. *Daşdəmiroğlunun ayağına getməyi, hörmət görmək əvəzinə onun ağır sözlərini yeməyi Muqim bəyə çox ağır gəlirdi.* S.Rəhimov.

9. Bir sıra sözlərə qoşularaq müxtəlif frazeoloji ifadələr düzəldilir; məs.: başını yemək, qəm yemək, ürəyini yemək, acıq yemək.

◊ **Yemək istəmək** – qızğın məhəbbət göstərmək, öz hissiyyatını bir şeylə ifadə etmək. *Mehriban məhəbbətlə qarışıq bir həyəcanla Rəmziyənin üzündən, dodaqlarından, gözlərindən öpməyə başladı. Onu öz öpüşləri ilə sanki yemək istəyirdi.* S.Hüseyn. **Yeməyi gəlmək** – 1) yemək xoşuna gəlmək, istəmək; 2) son dərəcə xoşuna getmək. *Adamın yeməyi gəlir.*

**YEMƏKXANA** *is.* Yemək hazırlanan və ictimai surətdə yemək yeyilən müəssisə; aşxana. *Fəhlə yeməkxanası. Tələbə yeməkxanası.* – [Qüdrət:] *Fəhlələrin sayı artdıqca .. yeməkxana, kino zalı da gərək olacaq.* M.Hüseyn. *Vahid dönəndə Gəldiyevin başıaçıq, yeməkxanadan çıxıb əl elədiyini gördü.* Mir Cəlal.

**YEMƏK-İÇMƏK** 1. *is.* Qonaqlıq.

2. B a x **yeyib-içmək**.

3. *is.* Yeyiləcək və içiləcək şeylər. *Yemək-içmək hazırlayıb yaxın meşəyə getdik.* A.Şaiq.

**YEMƏLİ** *sif.* 1. Yeməyə yarayan; yeyilən. *Gördülər ki, içi çörək, yemiş, cücə, yumurta və qeyri yeməli şeylərlə doludur*. S.S.Axundov. // Dadlı, ləzzətli. *Yeməli taamlar. Nə yeməli qarpızdır? Çox yeməli nardır.*

2. *məc.* Sevimli, istəkli, xoşagələn. *Haray, sevməli gəlin; Sevib yeməli gəlin; Xəlvətdə bir sözüm var; Sənə deməli, gəlin.* (Bayatı). *Böyüdün, əndamın olduqca incə; Yeməli qız oldun üçə gəlincə*. H.Cavid.

**YEMƏMƏZLİK** *is.* Yeməyə həvəsi olmama, yeməkdən imtina etmə; iştahasızlıq. *Xəstə yeməməzlikdən bir sümük bir dəri olmuşdur.*

**YEMİŞ** *is.* 1. Şirin bostan meyvəsi; qovun. *Bir dilim yemiş. Şirin yemiş. Yemiş acı çıxdı. Yemiş bir həftəyə dəyər.*

2. *top.* Hər cür quru meyvə. *Qışda yemiş çox yaxşı çərəzdir*. // Üzüm qurusu, kişmiş. // Ümumiyyətlə, meyvəcat.

**YEMİŞAN** *is.* Qırmızımtıl qara meyvəsi olan kol bitkisi və onun meyvəsi. *Yemişan kolu. Yemişan tikanı. Meşələrdə dərməyə yemişan çoxdur. – Kənddən bir qədər uzaqlaşanda çəpərliklər, sonra yol boyu axan kəhriz sularının gizləndiyi böyürtkən, yemişan kolluqları gəlir.* Mir Cəlal. *Gülgəz cəld .. əlləri ilə üzünü tutub yaxınlıqdakı yemişan pöhrənliyinin dalına qaçdı.* İ.Hüseynov.

**YEMİŞANLIQ** *is.* Çoxlu yemişan bitən yer. *Uşaqlar yemişanlıqda yemişan yığdılar.*

**YEMİŞÇİ** *is.* Yemiş satan, yaxud yaxşı yemiş tanıyan adam. // Meyvə qurudan, ya da quru meyvə satan adam.

**YEMİŞLİ** *sif.* Yemişi olan, meyvəsi olan, meyvə verən. *Bağçadır bir yanımız; İçi güllü, çiçəkli; Bir yanda bostanımız; Yemişli, xəlvirəkli*. O.Sarıvəlli.

**YEMİŞLİK** *is.* 1. Yemiş bitən, yemiş əkilmiş yer; yemiş bostanı.

2. Meyvələri asıb saxlamağa məxsus yer.

3. Meyvə qoymağa məxsus qab, meyvə boşqabı.

**YEMQARIŞDIRAN** *is. xüs.* Doğranmış müxtəlif yemi qarışdıran maşın.

**YEMLƏMƏ** "Yemləmək"dən *f.is. Mal-qaranı yemləmə üsulu.*

**YEMLƏMƏK** *f.* 1. Heyvanlara, quşlara yem vermək, heyvanları yedirtmək, otarmaq. *Quzunu yaxşıca yemləmək lazımdır. – Molla eşşəyi həmişə özü yemləyərmiş.* "M.N.lətif." *Yol üzərində bir qədər dincəlmək, atları yemləmək lazım gəldi.* S.Hüseyn. *Sənəm qarı toyuqları yemləyib pilləkənlə yuxarı qalxmağa başladı.* Ə.Məmmədxanlı.

2. Bitkiyə gübrə vermək. *Pambıq yetişənə qədər Şamama sahəni altı dəfə kətmənləmiş, üç dəfə əlavə yemləmişdi.* Ə.Əbülhəsən.

**YEMLƏNDİRİLMƏ** "Yemləndirilmək"-dən *f.is. Mal-qaranın vaxtlı-vaxtında yemləndirilməsi.*

**YEMLƏNDİRİLMƏK** *məch.* Yem verilmək, dən verilmək.

**YEMLƏNDİRMƏ** "Yemləndirmək"dən *f.is.*

**YEMLƏNDİRMƏK** b a x **yemləmək**.

**YEMLƏNMƏ** "Yemlənmək"dən *f.is.*

**YEMLƏNMƏK** *məch.* Yem verilmək, dən verilmək.

**YEMLƏTMƏ** "Yemlətmək"dən *f.is.*

**YEMLƏTMƏK** *icb.* Yem(dən) verdirmək. *Atları yemlətmək.*

**YEMLƏYİCİ** *sif.* və *is.* Yem verən, yem paylayan, heyvanlara yem verməklə məşğul olan (adam).

**YEMLİ** *sif.* Yemi olan.

**YEMLİK[1]** *is. bot.* Zəmilərdə, çöllərdə bitən dar, uzun yarpaqlı, südlü, yeyilən çoxillik ot bitkisi. *Yemlik otların arasında bitir. – O biri məhəllənin uşaqları da Laçının dəstəsi ilə yemlik dərməyə, oynamağa getdilər.* M.Hüseyn. *Nəhayət, kəpənək çiçəklənmiş bir yemlik kolunun üstünə qonanda Tapdıq papağını onun üstünə basdı.* Ə.Vəliyev. *Naxırçılar ellik çəmənliyinin lap yuxarılarına çıxaraq yemlik gəzirdilər.* Mir Cəlal.

**YEMLİK[2]** *is.* Heyvanlara yem verilən taxta qutu; yemqabı. *Kolxozçu heyvanın yemliyinə ot tökdü.*

**YEMLİK[3]** *sif.* Yem üçün ayrılmış, yem üçün saxlanmış. *Yemlik dən. – Yemlik çuğundurun yarpaqları zülali maddələrlə zəngindir.* – [Güləsərin] *..yemlik yeməkdən əlləri və dodaqları bir az qaralıb, şabalıdı rəngə düşmüşdü.* İ.Şıxlı.

**YEMLİKLİK** *is.* Çoxlu yemlik bitən yer (b a x **yemlik**[1]).

**YEMPÖRTƏN** *is. xüs.* Heyvan yemlərini bişirmək üçün qurğu.

**YEMSƏK** *sif. məh.* Axsaq.

**YEMSƏMƏ** "Yemsəmək"dən *f.is.*

**YEMSƏMƏK** *f. məh.* Axsamaq.

**YEMSİZ** *sif.* və *zərf* Yemi olmayan; ac. *Heyvanları yemsiz qoymaq.*

**YEMSİZLİK** *is.* Yemin olmaması, ac qalma, ac qoyma (heyvanı).

**YENCİLMƏK** *f. qəd.* Əzilmək, basılmaq. *Paltar yencildi. Qaysı yencilmişdir.*

**YENCMƏK** *f. qəd.* Əzmək, basmaq, sıxışdırmaq, xurd-xəşil eləmək. *Zərb ilən onu sərnigun edəyin; Əzəyin, yencəyin, zəbun edəyin.* Füzuli.

**YENDİRMƏ** "Yendirmək"dən *f.is.*

**YENDİRMƏK** b a x **endirmək**.

**YENƏ** *zərf* (bəzən *də* ədatı ilə). 1. Təkrar, bir daha, təzədən, yenidən. *Dünənki adam bu gün yenə gəldi. Bu gün yenə hava pisləşdi. Uşaqlar yenə qaçışmağa başladılar. – Gülbadam yenə də sual vermək istədi.* N.Nərimanov. *Məcnun kimi yenə düşdüm çöllərə.* Molla Cümə. *O günün sabahı Mirzağa üçüncü kərə olaraq Cəmilə ilə yenə üz-üzə gəldi.* S.Hüseyn. // Sual şəklində: təəccüb, heyrət, məmnuniyyətsizlik bildirir. *Yenə gəldin? Yenə narazılıq? Yenə də şikayət?*

2. Eyni qayda üzrə, əvvəlki kimi. *Yenə söhbətlər başladı. – Bir gün yenə Nigar xanımın ürəyi sıxıldı.* "Koroğlu". [Mərcan bəy:] *Balam, orada olmadı, gəl yenə burada danışaq.* Ü.Hacıbəyov. *Otuza az qalır Aygünün yaşı; Yenə od kimidir al yanaqları.* S.Vurğun.

3. Hər halda, hər necə olsa, hətta, belə, hələ də, o halda da. *Gec də olsa, yenə gələcəyəm. Dediyindən yenə də əl çəkmir. Bundan yenə o yaxşıdır.*

4. Eyni ilə, olduğu kimi, o cür. *Dünən necə etmişdinsə, yenə elə hərəkət et.*

**YENG** *is.* Paltarda: qolun ağız tərəfi, aşağı tərəfi; paltarın qolu. *Yengi ilə üzünün tərini sildi.*

**YENGƏ** *is. etnoqr.* Keçmişdə gəlin köçürülən zaman onun yanınca gedən və ona rəhbərlik edən qadın. *Önündə yengəsi, qucağında ayna, əllərində şamdan, musiqi ilə, gurultu ilə, tüfəng, tapança ata-ata, böyük dəbdəbə*

*və gurultu ilə* [gəlin] *aparsınlar.* A.Şaiq. *Sərhəng gəlin toyuna xonça aparan yengələr kimi .. qutunu stolun üstünə qoydu.* M.İbrahimov. ☐ **Yengə yolu, yengə payı** *etnoqr.* – toyda yengələrə verilən pay, hədiyyə. **Qız yengəsi** *etnoqr.* – qız evi tərəfindən təyin olunan yengə. **Oğlan yengəsi** *etnoqr.* – oğlan evi tərəfindən təyin olunan yengə.

**YENGƏC** *is. zool.* Qısaquyruqlu dəniz xərçəngi.

**YENGƏLİK** *etnoqr.* 1. *is.* Yengə gedən qadının işi, vəzifəsi. *Yengəlik etmək.*

2. *sif.* Yengəyə aid, yengəyə məxsus. *Yengəlik bəxşişi. Bir dəst yengəlik paltar.*

**YENGİ** 1. "Yeni"nin *qəd. forması. Zülfünü eylə kənar, olsun əyan əbrulərin; Yengi ay rövşənlənir, mahim, hava olduqca saf.* S.Ə.Şirvani.

2. Gələn il. *Nə söz dedim o gülə, məndən inciyib getdi? Bizim barışmağımız yengi il baharə çəkər.* Ə.Vahid.

**YENGİCƏ** *zərf* Yenicə, az əvvəl.

**YENGİYETİŞMİŞ** b a x **yeniyetmə**. [Ziba xanım:] *Sənə demədimmi, kişi, bu əlli yaşında yengiyetişmiş qız almaq sənə yaraşmaz?* M.F.Axundzadə.

**YENİ** *sif.* 1. İlk dəfə yaradılmış lap yaxınlarda meydana gəlmiş, törəmiş; təzə (*köhnə* ziddi). *Yeni əsər. Yeni paltar. Ən yeni maşınlar. – Hər gün bir yeni nəğmə; Hər gün bir yeni ilham; Yazaydım səhər-axşam.* M.Müşfiq. // İstifadə olunmamış, işlənməmiş, əcərli. *Yeni ayaqqabı. Yeni evə köçmək. Yeni silahlar. Yeni kostyum.* // Öz əvvəlki vəziyyətini saxlamış, dəyişməmiş halda qalmış. *Paltar yeni* (z.) *qalıbdır.*

2. Dövrümüzə aid olan, müasirimiz olan, müasir (*keçmiş, köhnə, əski, qədim* qarşılığı). *Yeni tarix. Yeni ədəbiyyat. Yeni dünya.* ☐ **Yeni il** – yanvarın birinci günü, üzümüzə gələn il. **Yeni iliniz mübarək!** – yeni il münasibəti ilə təbrik. // İndiki, hazırkı. *Yeni dövr. Yeni mərhələ.* **Yeni dillər** – qədim, ölü dillərdən fərqli olaraq bu gün mövcud olan dillər, müasir dillər. **Yeni insan, yeni adamlar** – müasirlərimiz. *Bizdədir sinfi şüurun əsli; Adımızdır yeni insan nəsli.* M.Müşfiq.

3. Təzə tapılmış, kəşf edilmiş, keçmişdə məlum olmayan. *Yeni planet. Yeni ulduz. Elmdə yeni qanun. Yeni kəşf. Yeni üsul.*

4. Əvvəlkinin yerinə gəlmiş, yaxud təyin olunmuş, əvvəlkini əvəz edən. *Yeni müdir. Yeni direktor. Yeni katib.* // Bir işdə hələ təcrübəsi olmayan; alışmamış, öyrənməmiş. *O, bu vəzifədə yenidir.* // Köhnəni əvəz edən, əvvəlkinin əvəzində tətbiq edilən. *Yeni qayda. Yeni vəzifələr. Yeni istiqamət. Yeni yol.*

5. Əvvəlki deyil, başqa, digər, bambaşqa. *Yeni məna. Yeni məzmun. Qarşımda yeni aləm açıldı. – İrəlidə Səmədi tamamilə yeni bir həyat, yeni işlər, yeni qayğılar gözləyirdi..* İ.Hüseynov.

6. Cavan, tər, bu ilin məhsulu; təzə. *Yeni taxıl. Yeni məhsul. – Onsuz açılmazdı yeni çiçəklər; Uçmazdı düzlərdə ağ kəpənəklər.* S.Vurğun.

7. *Zərf mənasında.* Bir az bundan əvvəl; təzəcə. *Bəzi vaxt Cəmilə* [Mirzağanın] *mənzilinə gəlir, yeni aldığı bir ev əşyasının nə yerə və necə qoyulmasını təyin edirdi.* S.Hüseyn. *Payızın sübhü yeni açılmışdı.* S.M.Qənizadə.

◊ **Yeni başdan** – b a x **yenidən**. **Yeni çıxma** – təzə meydana çıxmış, moda olmuş. *Yeni çıxma şey.* **Yenidən yeni** – lap yeni, lap təzə. **Yeni dünya** *köhn.* – Amerika. [Qara zənci:] *Amerika, Yeni dünya! Mənim doğma vətənimdir; Babamın ağ sümükləri çürümüşdür bu torpaqda...* S.Vurğun.

**YENİCƏ** 1. *zərf* Az əvvəl, indicə, təzəcə. *Yenicə getdi. Yenicə gözüm yuxuya getmişdi ki... – Üç yaşından beş yaşına varanda; Yenicə açılan gülə bənzərsən.* "Koroğlu". *Bu dəstəni təşkil edən üzvlərin kimisi yenicə çadrasını atmışdı, kimisi hələ buna cürət etməmişdi.* S.S.Axundov. // Təzə-təzə.

2. *sif.* Təzə, təzəcə, az və ya tamamilə yeni. *Yenicə bir şey.*

**yenicə-yenicə** *zərf* Təzə-təzə. *Yenicə-yenicə oxuyur, yazır.*

**YENİÇƏRİ** *is.* [*türk.*] 1. *tar.* Sultan Türkiyəsində adətən polis, cəza məqsədləri üçün istifadə edilən və sonralar ortadan qaldırılan imtiyazlı piyada qoşun və onun nəfəri. *Topçular top ata bilməz; Yeniçəri döyüş istəməz; Padşahdan imdad olmaz; Əsir olduq gavur əlində.* Aşıq Həsən.

2. *məc.* Zalım, zülmkar, zorla iş görən adam haqqında.

**YENİÇƏRİLİK** *is.* [*türk.*] *tar.* 1. Yeniçəri əsgərliyi, yeniçəri hissələrində qulluq etmə.

2. *məc.* Zorbazorluq, zülmkarlıq.

**YENİÇİ** b a x **yenilikçi**.

**YENİÇİLİK** b a x **yenilikçilik**.

**YENİDƏN** *zərf* Bir də, təzədən, təkrarən. *Yenidən çalmaq. Yenidən yazmaq. Yenidən başlamaq. Kitabı yenidən oxumaq. – Sofiya xanımın solmuş yanaqlarından yenidən yaş axmağa başladı*. Çəmənzəminli. *Neftin fontan vuran buruqlarına; Yenidən can verir Xəzər Bakıda.* Aşıq Şəmşir.

**YENİLƏMƏ** "Yeniləmək"dən *f.is.*

**YENİLƏMƏK** *f.* 1. Təzələmək, dəyişdirmək, təzəsi ilə əvəz etmək. *Vitrindəki malları yeniləmək.*

2. Yenidən etmək, təkrar etmək. *O sözü yeniləməyə ehtiyac yoxdur*.

**YENİLƏNDİRMƏ** "Yeniləndirmək"dən *f.is.*

**YENİLƏNDİRMƏK** b a x **yeniləmək**.

**YENİLƏNMƏ** "Yenilənmək"dən *f.is.*

**YENİLƏNMƏK** *məch.* 1. Yeni şəkil almaq, təzə kimi olmaq, təzələnmək. *Palto çevirtdirildikdən sonra tamamilə yeniləndi.*

2. B a x **yeniləşdirilmək**.

**YENİLƏŞDİRİLMƏ** "Yeniləşdirilmək"dən *f.is.*

**YENİLƏŞDİRİLMƏK** *məch.* Yeni hala salınmaq, yeni şəkil verilmək, təzələndirilmək, bərpa edilmək.

**YENİLƏŞDİRMƏ** "Yeniləşdirmək"dən *f.is.*

**YENİLƏŞDİRMƏK** b a x **yeniləndirmək**.

**YENİLƏŞMƏ** "Yeniləşmək"dən *f.is. Hər yerdə yeniləşmə, dəyişmə hərəkəti duyulurdu.* Mir Cəlal.

**YENİLƏŞMƏK** *f.* Tədricən yenilənmək, təzələnmək. *Yazda ağacların yarpaqları yeniləşir.*

**YENİLİK** *is.* 1. İstifadədə olmamış, hələ işlənməmiş şeyin hal və keyfiyyəti; təzəlik. *Paltarın yeniliyi. Maşınların yeniliyi*. // Yeni şeyin hal və keyfiyyəti. *Fikrin yeniliyi. Mövzunun yeniliyi.*

2. Yeni xəbər və əhvalat; dəyişiklik. *Elə bir yenilik yoxdur. Yenilikdən xəbərin varmı? Sənə bir yenilik deyəcəyəm.*

3. Yeni bir şey, keçmişdə olmamış, təzə meydana gəlmiş şey. *Elm və texnika yenilikləri. Yenilik gətirmək. – Təbriz qadınları bu yeniliyi sevirdi, çünki onlar bütün ömürlərində ancaq məscidləri, qəbiristanları, ziyarətgahları və ümumi hamamları görmüşdü.* M.S.Ordubadi. [Qorxmaz] *əlini ölçə-ölçə demişdi: – On ilin ərzində kənddəki yenilik tək bir məktəb binasından ibarətdir.* Ə.Vəliyev. // Yeni qayda, yeni üsul, yeni adət, yeni tətbiqə başlayan hər şey.

4. Dəyişiklik. *Vəziyyətdə heç bir yenilik yoxdur.*

**YENİLİKÇİ** *is.* Hər hansı bir sahədə yeni, mütərəqqi prinsiplər, ideyalar, üsullar və s. irəli sürən və həyata keçirən adam; novator.

**YENİLİKÇİLİK** *is.* Hər hansı bir sahədə yeni, mütərəqqi prinsiplər, ideyalar, üsullar və s. irəli sürmə və həyata keçirmə; novatorçuluq.

**YENİLMƏ** "Yenilmək"dən *f.is.*

**YENİLMƏK** *məch*. Basılmaq, məğlub edilmək, sarsıdılmaq. *Qarşıda dayanmaz dağlar, qayalar; Səndə yenilməyən div qüvvəti var*. R.Rza.

**YENİLMƏZ** *sif.* Basılmaz, məğlubedilməz, yıxılmaz, dağıdılmaz, çox möhkəm. *Yenilməz Sovet Ordusu. Yenilməz mübariz. Yenilməz qala. – İdarə etdiyimiz məmləkətin xalqı yenilməz və məğlubedilməz bir xalqdır!* M.S.Ordubadi. *Bu qarlı dağlara sığındı Babək; Azərin qəhrəman, yenilməz oğlu!* S.Vurğun.

**YENİLMƏZLİK** *is.* Basılmazlıq, məğlubedilməzlik, sarsılmazlıq, çox möhkəmlik.

**YENİŞ** b a x **eniş**.

**YENİŞ-YOXUŞ** b a x **eniş-yoxuş**. [Əbdürrəhman bəy:] ..*Qara dağdan ala dağa yeniş-yoxuş, dərə-təpə, axırda nədi, nədi? Kömür qaradı, qatıq ağdı*. N.Vəzirov.

**YENİ-YENİ** 1. *sif.* Təzə-təzə. *Yeni-yeni evlər. Yeni-yeni adamlar. Yeni-yeni qüvvələr.* – [Mirpaşa:] *Amma çox sağ ol, usta, mən səndən yeni-yeni şeylər öyrəndim.* Z.Xəlil.

2. *zərf* Yenicə, təzəcə, bir az əvvəl, indicə. *Uşaq yeni-yeni ayaq tutur. Xəstə yeni-yeni yeriməyə başlamışdır. – Təyyarələrin gurultusu yeni-yeni eşidilməkdə idi.* M.Hüseyn.

**YENİYETMƏ** *is.* Çox gənc, gənclik yaşına ayaq qoymuş oğlan və ya qız; ümumiyyətlə, gənc, cavan. *Uzunboylu, yeniyetmə, növcavan; Məni bu dərdlərə salan oynasın.* M.P.Vaqif. *Çox yaşlı kişilərin "matəm" hadisəsindən xəbərləri vardısa da, yeniyetmələr əsla buna vaqif deyildilər.* Qantəmir. *Çobanlar və yeniyetmələr alaçığın yanlarına çəkilərək, yeməyi*

*yığışdırıb ortanı açdılar, oynamağa başladılar.* M.İbrahimov. // Sif. mənasında. *Qapıda bizdən başqa dörd-beş çoban da xidmət edirdi. Hamısı yeniyetmə, bığıburma oğlanlar idi.* A.Şaiq. *Azərbaycanın yeniyetmə müəllimləri geridə qalmış arvadlara böyük bir həvəslə, sevinə-sevinə savad öyrədirdilər*. M.Hüseyn.

**YENMƏ** "Yenmək"dən *f.is.*

**YENMƏK** *f.* 1. Basmaq, məğlub etmək, qalib gəlmək. *Onu yenməkdə əlbir olsaq biz; Çox gözəl bar verər diləklərimiz.* A.Şaiq. *Nağını, Xaçoyu yendi cavanlar; Vuruşmasaq olmaz! – dedilər onlar*. H.K.Sanılı.

2. B a x **enmək**. *İndi dünyada qayda belədir ki, birisi ucadan alçağa yenə, dövlətlikdən kasıblığa düşə söhbəti həmişə aparıb çıxardacaq keçən günlərinə*. C.Məmmədquluzadə. [Kərim baba tüfəngi] *hər gün silər, təmizlər və arabir dərənin içinə yenərək bir yeri nişan alardı.* A.Şaiq.

**YENMƏZ** b a x **yenilməz**. [El:] *Var olsun yeni dünyanın yenməz mübarizi Elxan, urra!* C.Cabbarlı.

**YENMƏZLİK** b a x **yenilməzlik**.

**YENÓT** [*lat.* geneta] 1. *zool.* Tünd-sarı rəngli qiymətli xəzi olan yırtıcı heyvan.

2. Bu heyvanın dərisi.

**YEPƏLƏK** *is.* 1. Təzə tutulmuş alıcı quşu ələ öyrədərkən onun qabağına tutulan quş.

2. *məc*. Qapazaltı. [Mahmud:] *..Mənim acığım Adəmə tutur. Axı, o niyə arvada yepələk olurdu.* Ə.Haqverdiyev.

**YEPÍSKOP** [*yun.* episkopos] Xristian dinində yüksək ruhani rütbə və bu rütbəni tutan şəxs.

**YEPYEKƏ** *sif.* Çox yekə, lap yekə. *Yepyekə daş.*

**YEPYENİ** *sif.* 1. Çox yeni, lap yeni, tamamilə yeni. *Yepyeni paltar*. – [Səlma:] *İştə gümüş kəmər! Həm də yepyeni; Sonra yenə məmnun eylərəm səni.* H.Cavid.

**YER** *is.* 1. Üzərində sakin olduğumuz planet: Yer kürəsi (bu mənada böyük hərflə). *Ay Yerin peykidir. Yerlə Günəş arasında 150 milyon kilometr məsafə var. Yer Günəş ətrafında fırlanır.*

2. Quru (*su səthi* müqabili). *Dənizdən yer görünmürdü.*

3. Yer qabığının üst qatı; torpaq (bu mənada çox vaxt "altı" sözü ilə). *Yer altında qazılmış şaxta. Yer altından çıxan mədən. Yer altından tapılmış mədəniyyət abidələri. – Bizlər .. Kürün, Arazın və yerin altındakı suları qoyub, gedib yalandan Allaha yalvarırıq ki, bizə su göndərsin.* C.Məmmədquluzadə. [Əhməd:] *Bəs gərək yer qazam ki, oradan pul çıxsın.* Ə.Haqverdiyev.

4. Üzərində dayandığımız və hərəkət etdiyimiz sahə. *Yerdə oturmaq. Yerdən qaldırmaq. Əlindəki şeyi yerə qoymaq. Yer yaşdır. Tapdaq yer. – Amma hamı dövrə vurub yerdə oturub, təkcə Teymur əyləşib uca bir taxtın üstündə.* "M.N.lətif." *Məşədi Kazım ağa .. xıxlanmış dəvə kimi .. yerə çökdü*. M.S.Ordubadi. *Sanki göylərdə uçan quş kimiyəm; Sanki yerdən uçurulmuş kimiyəm.* M.Müşfiq.

5. Kənd təsərrüfatı məqsədləri üçün istifadə edilən (yaxud edilməyən) torpaq sahəsi. *Əkin yeri. Xam yerlər. Əkməyə yer azlıq edir. Mülkədar yerləri. – Eldarın atası Mərdəkanda xozeyinlərin bağında bağbanlıq edər, oğlu da su çəkər, yer işlər, araba qoşarmış.* S.Hüseyn.

6. Ölkə, ərazi, vətən, diyar, məmləkət. *Babalarımızdan qalan yerlər. – Sizə kimdən və nə yerdən danışım. Təbriz vilayətindən.* "Aşıq Qərib". [Bəkir:] *Bu yerlərə mən azçox bələdəm...* N.Vəzirov. *İnsan oğlu, uzaqlaşma, gəl yaxın; Başqa yerdən alınmasın sorağın.* M.Müşfiq.

7. Ölkə, vilayət, şəhər, kənd və s. *Bu yerləri birinci dəfə görürəm. Nə gözəl yerdir! Tanış yerlər. O yerlərdə olmamışam. Uzaq yerlərdən gələn qonaqlar.*

8. Üzərində bir şey olan, yaxud ola bilən müəyyən sahə, məntəqə, məkan və s. *Şəhərin bağ salınmış yeri. Küçənin qurtaran yerində. Yol dağa qalxan yerdə. Keçmişdə boş çöl olan yerdə indi böyük binalar ucalır.* // Bir işin, hadisənin və s.-nin baş verdiyi, ya olduğu məntəqə, məhəl. *Hadisə baş verən yer. Qəza yerinə getmək.* // Bir işə məxsus məhəl (ev, idarə, müəssisə, məntəqə və s.). *Əyləncə yeri*. – [Kərbəlayı Qubad:] *Bircə tez ol, başına dönüm, istəyirəm bu gün bir dükan yeri alım.* Ü.Hacıbəyov. *Mehriban bir ildən artıq bir zaman idi ki, teatr və kino kimi tamaşa yerlərinə getməmişdi.* S.Hüseyn. *Teymur onu tez-tez kinoya, teatra və rəqs yerlərinə aparırdı*. M.Hüseyn. // Bir məqsəd üçün ayrılmış

sahə, yer səthi, parçası. *İşləmək üçün yer ayırmaq. Qışlama yeri.*

9. Əyalət, mərkəz olmayan yer (adətən cəm şəklində). *Yerlərdən gələn nümayəndələr. Yerlərdə işləri canlandırmaq.*

10. Bir şeyin ayrıca hissəsi, parçası. *Paltar görünən yerindən ləkələnmişdir. Bədəninin bəzi yeri qızarmışdır. Dam çox yerdən axır.* // Kitabın, musiqinin, pyesin və s.-nin ayrıca hissəsi, parçası. *Əsərin yaxşı yerləri çoxdur. Komediyada gülməli yerlər azdır. Məqalənin bəzi yerlərini yenidən yazmaq lazımdır.*

11. Teatrda, kinoda, vaqonda və s.-də oturacaq (stul, skamya və i.a.). *Zalda hərə öz yerində oturdu. Biletiniz neçənci yerədir? Vaqona girib özünə yer tutdu.*

12. Ev, məskən, mənzil və s. *Qalmağa yeri yoxdur. Düşməyə yerin varmı?*

13. Vəzifə, xidmət, qulluq, iş. *Ştatda boş yer yoxdur. Yerlərin hamısı tutulmuşdur. Özünə bir yer tap, işlə. – Bəli, vaxt oldu ki, şəhərdə pristavlıq yeri açıldı.* N.Nərimanov. [Hacı Səməd xanın] *yerinə Tehran kabinəsinin məsləhəti ilə müavini Sərdar Rəşid təyin olundu*. M.S.Ordubadi.

14. İz, nişanə, əlamət, əsər. *Yara yeri. Tikiş yeri. Ləkənin yeri qalıb. Bıçaq yeri. – Qatıq dağılar, yeri qalar; Ayran dağılsa, nəyi qalar?* (Ata. sözü).

15. Ayrı olaraq götürülə bilən, sayıla bilən yük, bağlama. *Mənim 5 yer yükümün ağırlığı 40 kilo olmaz.*

16. *məc.* Mənbə, məxəz mənasında. *Lotubaşı, sən qovunu ver, mən sənə bir xeyirli yer deyim.* "Aşıq Qərib". [Aslan bəy:] *Yaxın yerdən bilmişəm. Özü xəbər göndərmiş*. C.Cabbarlı.

17. *məc. dan.* Ev, ailə mənasında. [Məmməd:] *..İkinci vəsiyyətim də budur ki, qızım Nərgiz xanımı varlı yerə ərə vermə.* "Aşıq Qərib".

18. Yorğan-döşək, yataq. *..Birisi gecə yatır və sübh yerindən duranda neçə xalvar elm və kamal sahibi olur, dəxi heç kəsi bəyənmir.* C.Məmmədquluzadə. [Vahid] *yerin içində oturub, yuxudan tamam ayılmaq üçün neçə dəfə kirpiklərini çaldı.* Mir Cəlal. ☐ **Yer salmaq** – yatmaq üçün bir yerdə yorğan-döşək düzəltmək, yataq hazırlamaq. *Durur, nənəm mənim üçün yer salır; Üstümü örtür, mənə layla çalır.* A.Səhhət. *Qulluqçu taxtapuşda yer saldı, çıxıb uzandım və vaxtından vaxtına da bişmiş-zad verirdilər.* Çəmənzəminli.

19. Parçada, xalçada və s.-də əsas rəng; fon. *Xalının yeri göydür. Bu çitin yeri məxməridir.*

20. Bir adamın cəmiyyətdə, ailədə, elmdə, idmanda və s.-də tutduğu mövqe. *Cəmiyyətdə öz yerini müəyyən etmək. Yarışda birinci yeri tutmaq.*

21. Qabın, yeşiyin, kisənin və s.-nin içərisində şey olmadan çəkisi. *Yerini çəkmək. Malın yeri nə qədərdir?*

22. **Yerdə** şəklində – ...halda, ...zaman(da), ...vaxt(da), ...məqamda. *O, getdiyi yerdə birdən yıxıldı. Qaçdığı yerdə ayağına tikan batdı.* – [Molla Xəlil] *müəllimi yaxşı yerdə tutmuşdu.* S.Hüseyn. *Camal əmi zarafatyana dedi: – Hə, ...ay arvad! İclasa getməyə şirin hazırlaşdığın yerdə mən səni saxladım.* Ə.Vəliyev.

23. **Yerində** şəklində – 1) öz məqamında, münasibət düşdükdə, öz vaxtında. *Lap yerində gəldin. Yerində söylənmiş söz. Bunları yerində demək lazımdır;* 2) düzgün olaraq, haqlı olaraq. *Onu yerində işdən çıxardılar. Ona yerində oldu;* 3) ...məqamında, ...vaxtında. *İşin şirin yerində soyuq bir şey Eyvaz kişinin sol qoluna dolandı.* Ə.Vəliyev; 4) ...vəziyyətində, ...halında. *Onun yerində mən olsaydım;* 5) durduğu, oturduğu yerdə. [Sultan] *sağa-sola baxdı, yerində qurcuxub stulu cırıldatdı.* İ.Hüseynov.

24. **Yer(in)də** şəklində – ...yaşında, ...sinnində, ...böyüklükdə. *Atası yerində kişi. Babam yerində qoca. – İsticə lavaşım var; Hər gecəyə aşım var; Demə, dədəm yerdəsən; Ancaq əlli yaşım var*. M.Ə.Sabir. [Əminə:] *Aralıqdan baxdım, gördüm iki qız xeylağı dayanıb. Biri olardı sənin yerdə, o biri demə görmədim, Fatma!* Qantəmir. [Qumru:] *Anam yerdə arvadsan, evimə gəlibsən, xoş gəlibsən.* Mir Cəlal.

25. **Yeridir** şəklində – layiqdir, cəzasıdır, əcəb olur. *Ona nə eləsələr, yeridir.* – [Əhməd:] *Vur, – deyirdi, – faşistə nə qədər güllə vursan, yeridir.* Mir Cəlal.

26. **Yerinə** şəklində – əvəzinə. *Onun yerinə yoldaşı qol çəkdi. Bizim yerimizə də təbrik elə. – Mən Molla Vaqifəm, eylərəm əfqan;*

*Gözlərim də yaş yerinə tökər qan.* M.P.Vaqif. [Nurəddin ağa:] *..Mədrəsə yerinə, azarxana yerinə, bax gör, hansı yolla tarac olur sərmayə.* N.Vəzirov. ☐ **Yerinə qoymamaq** – qətiyyən saymamaq, ...hesab etməmək. *Necə ki şikəst adamları adam yerinə qoymazlar, bizi də o biri millətlər adam yerinə qoymurlar.* C.Məmmədquluzadə. *..Bu allahsız qızı heç olmazsa gözünün ucu ilə də baxmır.* [Ələmdarı] *kişi yerinə qoymur, qozbel faytonçu Topuşdan da aşağı tuturdu.* S.Rəhimov.

◊ **Yer altından yasa gedən** – gizlincə, əlaltından iş görən adam haqqında. [Kəndli:] *Elədir, bu molla Qafar çox yer altından yasa gedəndir.* S.Rəhimov. **Yer altından yasa getmək** – gizlicə, əlaltından, heç kəsin xəbəri olmadan iş görmək. **Yer eləmək** – 1) başqası oturmaq üçün bir qədər o yana çəkilmək, çəkilərək başqasına yer vermək. *Bir az yer elə, o da otursun. – Sədr cəld geri çəkilib heyətdə Hacıya yer elədi.* Mir Cəlal; 2) *məc.* təsir etmək, ağır gəlmək, tutmaq. *Deyəsən, söz ona yer elədi. – Sarıqlı mollanın* "*cahad*" *haqqındakı sözləri çox adamlara yer elədi.* Mir Cəlal. *Dünənki iclas Gülşənə yaman yer eləmişdi.* Ə.Vəliyev. **Yer quruculuğu** – torpaqdan istifadə qaydalarını nizama salan tədbirlər sistemi. *Yer quruculuğu işləri.* **Yer oynamaq** – yer tərpənmək, zəlzələ olmaq. **Yer tutmaq** *məc.* – 1) rol oynamaq, mövqe tutmaq, bu və ya başqa əhəmiyyəti olmaq. *Cabbarlının əsərlərində qadın çox görkəmli bir yer tutur.* M.Arif; 2) əbəs yerə çox sahəni işğal etmək, artıqlıq etmək. *Bu şeylər burada ancaq yer tutur.* **Yer üzündən götürmək** – yox etmək, aradan qaldırmaq. **Yer üzündən götürülmək** – yox edilmək, ortadan qaldırılmaq. [Sara xanım:] *Götürüb qəzetçilərə buyruq vermisən, onlar da yazırlar ki, gərək tezliklə çadra yer üzündən götürülsün.* Qantəmir. **Yer üzündən yox olmaq** – yoxa çıxmaq, itmək. *Sədinin* "*Gülüstan*"*ı neçə vaxtdır ki, yer üzündən yox olubdur. Hər kəs yerini bilirsə və ya özündə varsa, idarəmizə xəbər versin.* "Mol. Nəsr." ...**yer yox idi (yer də yoxdur)** – çox qələbəlik, həddən artıq çoxluq, basabas, sıxlıq bildirir. *Adam əlindən yer yoxdur. – Bakı vağzalının səkilərində tərpənməyə yer yox idi.* Mir Cəlal. **Yerdə qalanı** – 1) bir şeyin, vaxtın qalan qismi. *Üç saat məktəbdə keçirdiyi vaxtdan başqa, günün yerdə qalanını Əmiraslan hər bir əmr və göstərişdən azad idi.* S.S.Axundov; 2) digərləri, başqaları. **Yerdə qalmaq** – 1) cəzasız qalmaq, əvəzi verilməmək. *Yara deyin, bizdən qarğış almasın; Yerdə qalmaz ahü zari Həsənin.* Aşıq Həsən. [İsmət:] *Ah, qanın yerdə qaldımı, Qanpolad?!* H.Cavid; 2) nəzarətsiz qalmaq, baxımsız qalmaq, köməksiz qalmaq, himayəsiz qalmaq; 3) qalıq olmaq. *Yerdə nə qədər qaldı?* 4) heç kəs tərəfindən istənilməmək, bəyənilməmək. **Yerdən göyə qədər (kimi)** – son dərəcə çox, həddindən artıq. *Aralarında yerdən göyə qədər fərq var. – Zeynəb oğlundan yerdən göyə kimi razıdır.* C.Məmmədquluzadə. **Yerdən olmaq** – 1) avara-sərgərdan qalmaq, vəzifəsindən və s.-dən məhrum olmaq; 2) başqasının təhriki ilə fikrini, qərarını dəyişdirmək. [Şəhrəbanu xanım:] *Müsyö Jordanın və Şahbazın bir para ağılsız sözlərindən yerdən oldu.* M.F.Axundzadə. **Yerdən-yerə vurmaq** – 1) çırpmaq. *Qürbət xala o gün nə silə, nə süpürə bildi. Sancı çəkən hamilələr kimi qıvrıldı, açıldı, özünü yerdən-yerə vurdu.* Mir Cəlal; 2) *məc.* heç etmək, puça çıxartmaq. **Yerə atmaq (tullamaq)** – b a x **yerə salmaq**. **Yerə batasan! Yerə batsın! Yerə batmış** – qarğış ifadəsi. [Ağabanı Məşədi Səfərə:] *..Ay külbaş, sənin Kərbəlayı Xuduş kimi lay-lay oğlanların ola-ola, ay yerə batasan, sənin təzədən evlənməyinin nə mənası var.* M.Əliyev. **Yerə batmaq** – adı, sorağı qalmamaq, əsər-əlaməti qalmamaq. *Yerə batsın deyilir şərlə zülüm; Qalmasın yerdə nə zülmət, nə ölüm!* S.Vurğun. **Yerə girmək** *məc.* – 1) çox xəcalət çəkmək, çox utanıb sıxılmaq. [Gəray ağa:] *Axı sən niyə utanıb-qızarıb yerə girmirsən?* S.Rəhimov; 2) b a x **yerə batmaq**. [Bibixatun:] *..Sənin namusun olsa əriyib yerə girərsən. Utanmayıb başına papaq qoyub gəzirsən, deyirsən kişiyəm.* Ə.Haqverdiyev. **Yerə qoymaq** – bir daha etməmək, əl çəkmək, tərgitmək. *Bu xasiyyətini yerə qoy. – Səttar kişi onunla zarafatlaşmağı yerə qoymurdu.* Ə.Əbülhəsən. **Yerə salmaq** – 1) düşürmək, endirmək, devirmək; 2) *məc.* nəzərə almamaq, yerinə yetirməmək, rədd etmək. *Bağlama, aç üzünü; Örtmə o qaş-gözünü; Gəl mənə naz*

*eləmə; Yerə salma sözümü.* (Bayatı). **Yerə sərilmək** – yıxılmaq, yerdə uzanıb qalmaq. *Qopdu qanlı bir fırtına; Ölüm hökmü verildi; Qarşı duran igid gənclər; Bir-bir yerə sərildi.* A.İldırım. **Yerə soxmaq** – utandırmaq, başını aşağı etmək, xəcalət çəkməsinə səbəb olmaq, rüsvay etmək. [Turxan oğluna:] *Daha nə olacaq!.. Daha nə olsun ki, dost-düşmən içində bizi yerlərə soxdun!* H.Cavid. **Yerə vurmaq** – 1) məğlub etmək, yenmək; 2) heçə çıxarmaq, puça çıxarmaq. *Çəkilən zəhməti niyə yerə vurursan? – Şairlik adını yerə vuranlar; Sinəmə yüz yerdən yara vuranlar*. Şəhriyar. **Yeri deyil** – 1) ...arasında olmamalıdır. *Bura onun yeri deyil. Ora bizim yerimiz deyil;* 2) qeyri-münasibdir, münasibətsizdir. *Bu sözlərin yeri deyil. – Axır, bunu uşaq da bilir ki, meydan xanım yeri deyil, meydana pəhləvanlar çıxıb güştü tutarlar.* C.Məmmədquluzadə. [Kamilə:] *Bu saat o söhbətin yeri deyil.* S.Rəhman. **Yeri düşəndə (gələndə)** – münasib olanda, münasib vaxt düşəndə, məqamında, məqamı çatdıqda. *Dünyada faydalı, dəyərli nə var; Toplamaq istədim yeri düşəndə; Səadəti üçün mən öz xalqımın; Öyrənmək istədim düşmənimdən də*. O.Sarıvəlli. **Yeri gəlmişkən** – təsadüfdən istifadə edərək, fürsətdən istifadə edərək, məqamı gəlmişkən. *Yeri gəlmişkən onu da deyim ki, ... – Yeri gəlmişkən burada ərəb əlifbasının birinci tərtibini və rəqəm vəzifələrini göstərəlim.* F.Ağazadə. **Yeri görünmək** – bir yerdə, məclisdə və s.-də olmayan, lakin olması arzu edilən adam haqqında çox zaman ölən adam haqqında deyilir. *Köçüb gedən o əziz dostların yeri görünür; Sədaları qarışıb çöllərin nəvası ilə*. Şəhriyar. **Yeri var(dır)** – 1) yerində olar, haqlı olar. *Yeri vardır nə qədər gəlsən əgər fəryadə.* M.Hadi. *Mən də şimşək kimi çaxsam, yeri var; Çağlayanlar kimi axsam, yeri var.* M.Müşfiq; 2) münasib olar. [Asya:] *..Bilmirəm hayandan gəldi çıxdı bura arşınmal alan? ..Genə bir bəy balası ola, ya bir tacir oğlan ola, yeri var.* Ü.Hacıbəyov. **Yeri yoxdur** – əbəsdir, mənasızdır, yersizdir, artıqdır, lüzumsuzdur. [Qoca kəndli:] *Canım, boş qışqırmağın yeri yoxdur.* Ə.Haqverdiyev. **Yerin altını da, üstünü də bilmək** – hər şeyin təfərrüatını bilmək (adətən çoxbilmiş və hiyləgər adam haqqında). *O, yerin altını da bilir, üstünü də.* – [Ələmdar:] *Daha biz bəy deyilik ki, yerin altını da, üstünü də əlimizin içi kimi bilək.* S.Rəhimov. **Yerin təkindən (dibindən)** *məc.* – haradan olursa olsun. **Yerində bitmək (donmaq)** – 1) yerində olmaq, yerində oturub qalmaq; 2) *məc.* donub qalmaq, heyrət içində qalmaq. *İmamqulu gözlərini alaçığın bacasına dikib yerində bitdi.* Çəmənzəminli. *Gülpəri daş kimi yerində donur; Ala gözlərindən üsyan oxunur...* S.Vurğun. **Yerində qalmaq** – olduğu yerdəcə ölmək. *Əlini naqana atdığı zaman; Göy Vəli mıx kimi yerində qalır; Titrəyib, xəncəri əlindən salır.* S.Vurğun. **...yerində olmamaq** – münasib olmamaq, uyğun olmamaq. **Yerində oturtmaq** *məc.* – çox lovğa, iddialı adama eybini, ləyaqətini göstərərək cavab vermək, həddini göstərmək, yerini göstərmək. *Telli arvad* ..[Rüstəm kişiyə] *baxanda filosofluq edib deyirdi: – Ay qoca dünya, o qədər mənəm-mənəm deyənləri yerində oturtmusan!* M.İbrahimov. **Yerində saymaq** – 1) durduğu yerdə addımlamaq; 2) *məc.* inkişaf etməmək, irəliləməmək, irəli hərəkət etməmək, olduğu yerdə qalmaq. [Süsən:] *Hər halda biz yerində sayanlardan deyilik.* İ.Hüseynov. *Görün hələ nə qədər; beyni iflic olan var; öz yerində sayan var.* X.Rza. **Yerində turp əkilmək** – bərbad olmaq, xaraba qalmaq, uçulub-dağılmaq. [Gəray ağa:] *Mülkünüz xaraba qalacaq, bəlkə xan sarayının divarları kimi dözüm gətirməyəcək. Yerində turp əkiləcəkdir.* S.Rəhimov. **Yerindən dəli kimi qalxmaq (sıçramaq)** – hövlnak qalxmaq, yerindən sıçramaq. [Rupça xatun] *yerindən dəli kimi qalxdı*. Çəmənzəminli. **Yerindən eləmək** – 1) avara qoymaq, öz əsas işindən ayrılmasına, avara qalmasına səbəb olmaq; 2) yerindən, yuvasından məhrum etmək. **Yerindən qımıldanmamaq** – 1) tərpənməmək, qımıldanmamaq; 2) səsi çıxmamaq. *Bütün bu müddətdə Molla min dəfə özündən gedirsə də, yerindən qımıldanmır.* "M.N.lətif." **Yerindən oynatmaq** – 1) laxlatmaq; 2) *məc.* təhrik edərək fikrini, qərarını dəyişdirməyə, yaxud bir işə iqdam etməyə məcbur etmək. *Molla Sadığın təmkinlə söylədiyi bu sözlər adamları yerindən oynatdı.* İ.Şıxlı. **Yerinə düşmək** – münasib vaxtda olmaq, məqamında olmaq,

uyğun olmaq. *Mirzə Cavad sözünün yerinə düşdüyünə sevindi.* Mir Cəlal. **Yerinə gəlmək** – ölən bir arvadın yerinə ərə getmək. [Xədicə] *anasının yerinə gələn qadınla yola gedə bilməmişdi.* S.Hüseyn. **Yerinə yetirmək** – icra etmək, həyata keçirmək. *Tapşırığı yerinə yetirmək. Vəzifəsini yerinə yetirmək. – Müqim bəy xanımın meyvəcat barədə tapşırığını yerinə yetirdikdən sonra Alagözü* “*güzgü otağına*” *gətirdi.* S.Rəhimov. **Yerini almaq** – həyata keçmək, yerinə yetirilmək. *Nisə xalanın sərəncamı bütün mənası ilə yerini alırdı.* Qantəmir. **Yerini dar eləmək (etmək)** – maneçilik, narahatlıq, çətinlik törətmək; hərəkətinə, inkişafına, fəaliyyətinə mane olmaq. [Güllü:] *Bircə de görüm mən sənə neyləmişəm? Yerini dar eləmişəm, ya ərini əlindən almışam?* Ə.Haqverdiyev. **Yerini göstərmək** – 1) bir şeyi nişan vermək; 2) b a x **yerində oturtmaq**. *Tahir bir istədi qışqırsın, tülküsifət natiqi fitə bassın, ona öz yerini göstərsin, amma məclisdə oturanların töhmətindən çəkinib dinmədi*. M.Hüseyn. **Yerini xəlvət etmək** – yerini heç kəsə bildirməmək, yerini gizli saxlamaq. *Tamam beş günün müddətində yerimi xəlvət etmək üçün gündə bir ev dəyişdim.* “Mol. Nəsr.” **Yerini tutmaq** – əvəz etmək. *Heç bir adam onun yerini tuta bilməz.* – [Sayalı:] *Maşallah, yekə oğlan olubsan, torpağı sanı yaşayasan, lap atan Səmədin yerini tutubsan.* İ.Şıxlı. **Yerini verməmək** – əvəz edə bilməmək. *Heç şey verməz bu dağların yerini; Min bir rəngə girir burda təbiət.* S.Rüstəm. **Yerlə yeksan etmək** – 1) yerə tökmək, dağıtmaq; 2) *məc.* məhv etmək, xarabaya döndərmək, uçurub dağıtmaq, viran etmək; 3) vurub öldürmək. *Saymadan sultanı, xanı; Eyləyibsən nahaq qanı; Badam kimi növcavanı; Yer ilə yeksan eylədin.* Aşıq Pəri. **Yerlə yeksan olmaq** – 1) yerə tökülmək, dağılmaq. *Sünbüllər yerlə yeksan olmuşdu;* 2) *məc.* xarabaya dönmək, uçulmaq, məhv olmaq, viran olmaq. *Şəhər göyə sovrulub; Yer ilə yeksan oldu; Min ilin yaratdığı; Bir ana qurban oldu.* B.Vahabzadə. *Mirzə ata-anasının az qala yerlə yeksan olmuş qəbirlərinə baxdı, sonra qonur gözlərini Qədirin üzünə zillədi.* İ.Məlikzadə. **Bir yerdə** – b a x **bir**. [Mərcan bəy:] *Sözün doğrusu, daha bundan sonra mən səninlə bir yerdə .. çörək yeməyəcəyəm.* Ü.Hacıbəyov. *Bir gün Qərənfillə Bahadur yenə adi qayda üzrə bir yerdə evə dönürdülər.* S.Rəhman. **Bir yerə (araya) gəlmək** – toplanmaq. **Bir yerə gəlmək** – bir qərar vermək. *Mübahisədən nə çıxar, bir yerə gəlmək lazımdır.* **Boş yerə** – b a x **boş**. *Ömrü ucuz verdi... bir iş görmədən; Boş yerə ölməyin nə mənası var?!* B.Vahabzadə. **Dan yeri** – b a x **dan**. **...duran (olan) yerdə** – ...var ikən, ...olaola. *Amma mən duran yerdə Qədirin qulluğa getməsi, lap nahaqdır.* Mir Cəlal. **Qara yer** – qəbir, məzar. **Qəlbində yer eləmək (etmək, salmaq)** – özünə yer tutmaq, əsər və əlamət buraxmaq. *Silindi qəlbində yer salan qəhər.* M.Rahim. *Öldürdüyü düşmənə qarşı olan nifrət hissi ilə qarışıq bir acı duyğu da gənc qızın hələ qəlbində yer etməyə macal tapmamışdı.* Ə.Əbülhəsən. **Nahaq yerə** – b a x **nahaq**. **Nə yerdə** – hansı vəziyyətdə. *İşləriniz nə yerdədir? Onun məsələsi nə yerdə qaldı?* **...o yerə (elə yerə) çatdı ki,** ... **(çatmışdı ki,** ...) – bir işin, hadisənin gedişində ən son nöqtəni, həddi bildirir. *Söhbət o yerə çatdı ki, ...* – [Rübabənin] *Vahid ilə ünsiyyəti o yerə gəlib çatmışdı ki, heç biri o birindən kənarda yaşamır, yaşaya bilmirdi.* Mir Cəlal. **...olan yerdə** – 1) ...olduğu halda, bir halda ki, ... *Aşkar şeydir ki, təzə olan yerdə köhnə qanunlar gərək pozulsunlar.* C.Məmmədquluzadə; 2) ...kimi, ...olaraq. *Kəsbkarlıqdan əlin çıxdı, usan! Ər olan yerdə, görüm, yox olasan*. M.Ə.Sabir. **Öz yerində** – qaydada, nizamda. [Süleyman:] *Şükür Allaha, hər şey öz yerində sazdır.* Ü.Hacıbəyov. **Öz yerindədir** – öz qabiliyyət və ləyaqətinə görə vəzifə tutan adam haqqında. *İndi o, öz yerindədir.* **Sağ yer qoymamaq** – b a x **sağ**. **Yalan yerə** – nahaq yerə; nahaqdan, yalandan. *Dövlətliyə yaltaqlana bilmərəm; Qəmli ikən, yalan yerə gülmərəm.* M.Ə.Sabir.

**YERALMASI** *is.* Kartofa oxşayan, yeməli kökü olan tərəvəz bitkisi. // *məh.* Kartof.

**YERALTI** *sif.* Yerin içində, yer səthinin altında olan. *Yeraltı sərvətlər. Yeraltı sular. Yeraltı yol. Yeraltı mədən. Yeraltı istehkam. Yeraltı sığınacaq. – Gecədən xeyli keçmiş, yeraltı qazmada qırıq bir şam işığında Ulduz anasına öz zərif qızlıq nəvazişlərindən hörülmüş işıqlı bir məktub yazırdı.* Ə.Məmmədxanlı.

**YERBƏYER** *zərf* 1. Hər biri öz yerində; qaydada, müntəzəm. *Məclis əhli yerbəyer əyləşdilər*. "Aşıq Ələsgər". [İlyas:] *..O kişilərdən gələn kağızları yerbəyer saxlasın*. S.Rəhimov. □ **Yerbəyer etmək (eləmək)** – 1) hər şeyi öz yerinə qoymaq, nizam və səliqə ilə yığmaq, yerləşdirmək, qayda ilə qoymaq. *Sona ev işinə məşğul idi və Bahadır öz şeylərini yerbəyer edirdi.* N.Nərimanov. *Osman dükanı üçün gətirdiyi malları yerbəyer etməklə məşğul idi.* M.Hüseyn. [Əlləzoğlu] *süfrədə hər şeyi yerbəyer elədi, qara kirli əlləri ilə şişləri bir-bir qamarlayıb kababı iri, çökək bir nimçəyə çəkdi.* İ.Hüseynov; 2) rahatlamaq, yerləşdirmək. *Qərəz, oğlan atı yerbəyer eləyəndən sonra yuxarı çıxdı*. (Nağıl). *Gecə gəlib səni yerbəyer edərəm.* M.S.Ordubadi. *Hamını yerbəyer eləyəndən sonra, müəllim gülə-gülə uşaqlara dedi..* Mir Cəlal. **Yerbəyer olmaq** – qayda ilə yerini tutmaq, yerləşmək, hərə öz yerini tutmaq.

2. Hər yerdən, hərə bir tərəfdən, hərə öz yerindən. *Həsrətindən əlif qəddim büküldü; Cismim bəndi yerbəyerdən söküldü.* M.V.Vidadi. *Qızlar gülüşərək yerbəyerdən qışqırışdılar*. Ə Məmmədxanlı.

**YERBƏYERLƏŞDİRMƏ** "Yerbəyerləşdirmək"dən *f.is.*

**YERBƏYERLƏŞDİRMƏK** *f.* Hər birini öz yerinə qoymaq, yerbəyer etmək. *Şeyləri yerbəyerləşdirmək.*

**YERBƏYERLİ** *zərf* və *sif.* Lazımi qaydada, lazımi surətdə, dəqiq surətdə. *Qadir .. yastı daş döşənmiş həyətə çıxaraq əzazil Əminənin əmrini yerbəyerli icra etməyə başladı.* Ə.Əbülhəsən.

**YERDƏNÇIXMA** *sif.* Torpağın altından, yerin içindən çıxan.

**YERDƏYİŞDİRMƏ** 1. B a x **yerdəyişmə** 1-ci mənada.

2. Bir şeyi bir yerdən götürüb başqa yerə qoyma.

**YERDƏYİŞMƏ** *is.* 1. Olduğu və ya oturduğu yerdən başqa yerə keçmə, bir yeri buraxıb o birinə getmə.

2. *dilç.* Sözdə iki qonşu səsin qeyri-iradi olaraq yerini dəyişməsi hadisəsi; metateza; məs.: vağzal-vağzal; yarpaq-yarpaq.

**YERDOMBALANI** *is. bot.* Göbələklər qrupuna daxil olan kartofaoxşar kökümeyvəli tərəvəz bitkisi.

**YEREŞƏN** *is. zool.* Həşəratyeyənlər dəstəsindən kiçik məməli heyvan.

**YERƏBAXAN** *is.* və *sif.* Zahirən sakit, dinməz, zərərsiz görünən, əslində isə hiyləgər, fitnəkar, xəbis adam haqqında. *Suyun lal axanı, adamın yerəbaxanı*. (Məsəl). *Qaraqabaq, yerəbaxan, gözü gömgöy, rəngi kürən; O fitnələr övladının hiylə yağır sifətindən.* S.Vurğun.

**YERƏNCİRİ** *is.* Vaxtından əvvəl yetişən əncir, tezyetişən əncir. *Bu il yerənciri yoxdur.*

**YERFINDIĞI** *is. bot.* Fındıq kimi meyvələri olan kol bitkisi və onun meyvəsi; araxis.

**YERFISDIĞI** b a x **yerfındığı**.

**YER-GÖY** *is.* Dünya, kainat. [Molla özözünə:] *Ay Hacı Molla Cəlil ağa, sən olasan yeri-göyü yox yerdən xəlq edən Allaha, içmə bu kafirlərin dərmanını.* C.Məmmədquluzadə. *Yeri-göyü titrədən partlayış nərəsilə; Çıxarırlar yer altdan bol filiz yataqları.* Ə.Cəmil. // Hər yer, bütün aləm. *Yerə-göyə hökmün işlər; Sənsən Süleyman, a Pəri!* Aşıq Ələsgər.

◊ **Yer-göy ağlamaq** – çox fəlakətli, acı, acınacaqlı halı bildirir. [Bundan əlavə] *hərgah nəql etsəm, bu biçarə, bədbəxt fəhlələrin başlarına nayibləri nə müsibət gətirirlər, yer-göy ağlar.* N.Vəzirov. **Yer-göyə sığmamaq** – 1) çox sevinmək, çox şad olmaq; 2) bir şeyin həddən artıq çoxluğunu bildirir. *Mənim dərdim yerə-göyə sığası deyil, mənim günüm taybuynuz öküzün günündən bədtərdir*. F.Köçərli. *Qoy başqası nə cür düşünür düşünsün, Səmədin isə sevinci yerə-göyə sığmırdı.* İ.Hüseynov.

**YERİDİLMƏ** "Yeridilmək"dən *f.is.*

**YERİDİLMƏK** "Yeritmək"dən *məch*.

**YERİK** *is.* Hamilə qadınlarda ağız dadının azması halı. // Tamah mənasında.

**YERİKLƏMƏ** 1. "Yerikləmək"dən *f.is.*

2. *is.* Hamiləlik dövründə ağız dadının azması nəticəsində hamilə qadının turşu və ya başqa şeylər istəməsi.

**YERİKLƏMƏK** *f.* 1. Hamiləlik dövründə ağız dadının azması nəticəsində turşu və ya başqa şeylərə ehtiyac hiss etmək. *Onun anası*

*yerikləyəndə aslan ətinin kababını yemiş imiş.* M.İbrahimov.

2. *məc.* Bir şeyin həsrətində olmaq, bərk istəmək, həris olmaq. [Koroğlu dedi:] *Koroğlu fərmanı mərdi-mərdanə; Dəlilərim yerikləyir al qana.* "Koroğlu".

**YERİMƏ** "Yerimək"dən *f.is.*

**YERİMƏK** *f.* 1. Ayaqlarını işə salaraq hərəkət etmək; addımlamaq. *İrəli yerimək. Bərk yerimək. Yeriyə bilməmək. Çox yeriməkdən yorulmaq. – Yeriyən at özünə qamçı vurdurmaz.* (Ata. sözü). *Bir qoca köhnə paltar əynində; Yeriyir yolda torba çiynində.* A.Səhhət. [Məhəmmədhəsən əmi] *yovuqa yeriyib başladı yumşaqlıqnan oğlunu sakit eləməyə.* C.Məmmədquluzadə. // Hərəkət etməyə, gəzməyə iqtidarı olmaq. *Uşaq hələ yerimir. Xəstə indi-indi yeriməyə başlamışdır.*

2. Hərəkət etmək (getmək, üzmək). *Maşın ağır yeriyir. Dənizdə qayıqlar yeriyir. – Maşın yenicə yeriməyə hazırlaşırdı ki, Tapdıq qırğı kimi şığıyıb maşını götürdü.* Ə.Vəliyev. // İşləmək. *Saat yerimir.*

3. Üzərinə getmək, hücum etmək, axın etmək. *Ordu qərbə yeridi.*

4. Keçmək, qəbul olunmaq, yayılmaq. *Bu işlər bizim vilayətdə yeriməz, vəssalam!* C.Məmmədquluzadə.

5. Bir şeyin içinə batmaq, keçmək, girmək. *Buğa güc gələndə oğlanın ayağı topuğuna qədər torpağa yeridi.* M.Rzaquluzadə.

**YERİNDƏCƏ** *zərf* Dayandığı yerdə, durduğu və ya oturduğu yerdə; oradaca. *Təəccübdən yerindəcə qaldı. Yerindəcə canı çıxdı.*

**YERİTDİRMƏ** "Yeritdirmək"dən *f.is.*

**YERİTDİRMƏK** *məch.* Yeriməyə məcbur etmək.

**YERİTMƏ** "Yeritmək"dən *f.is.*

**YERİTMƏK** *icb.* 1. Yeriməyə, hərəkət etməyə məcbur etmək. // Yeriməsinə kömək etmək, gəzdirmək. *Ayaq açan uşaqları yeridirlər.*

2. Sövq etmək, hücum etdirmək. *Qoşun yeritmək. – Hər iki tərəf meydana yeni-yeni qüvvələr yeridirdi.* S.Rəhimov. *Xəzərin sahilinə xəzri qoşunlar yeridir; Titrəyir qumların üstündə səhərdən bəridir.* S.Rüstəm.

3. Bir şeyin içinə girməyə məcbur etmək, daxil etmək. *Torpaq* .. [ərik ağacının] *vücuduna məlhəm yeridirdi.* Mir Cəlal.

4. Həyata keçirmək, intişar etmək. // Təklif etmək, irəli sürmək, yaxud qəbul etdirməyə, keçirməyə çalışmaq. *Fikir yeritmək. Öz təklifini zorla yeritmək istəyir. – Hərcayı .. yalanı yeridir doğru yerinə.* Q.Zakir. ◻ **Dediyini yeritmək** – öz fikrini, təklifini zorla keçirmək. *O yıxılmadıqca, mən heç bir vaxt öz dediyimi yeridə bilməyəcəyəm.* M.Hüseyn. *Ancaq Rübabə bəriki otağa keçəndə Fatma duydu ki, əri dediyini yeritmişdir.* Mir Cəlal.

5. *dan.* Batırmaq, soxmaq. *Anamın canı üçün, bu tiyəni düz qarnına yeridəcəyəm.* P.Makulu.

6. *məc. dan.* Aldadaraq birinə satmaq, işə vermək; ötürmək.

**YERİŞ** *is.* 1. Yerimək tərzi, yerimək işi. *Sallana-sallana gedən Salatın; O sərxoş yerişin yola yaraşır.* Aşıq Ələsgər. [Kor kişi] *tamamilə əski həyatın bir yadigarı idi. Əlbisəsinin tərzi, biçimi avamlığını, yerişi gözsüzlüyünü andırırdı.* S.Hüseyn. *Səməd* [qadının] *üzünü görməsə də, yerişindən, boy-buxunundan, tərpənişindən onun lap cavan olduğunu dərhal bildi.* İ.Hüseynov. ◻ **Ayı yerişi** – iki yana basa-basa yerimə.

2. Yürüş, axın, hücum. *Xotkar yazmışdı ki, qoşun hazırlayır, Çənlibelə yeriş olacaq.* "Koroğlu". ◻ **Yeriş etmək** – axın halında hərəkət etmək, hücum etmək. [Vəli:] *Belə yapıncını çəkdim döşümə, papağımı basdım gözümün üstünə, çomağı aldım əlimə, düşdüm sürülərin qabağına, ləhləyə-ləhləyə birbaş yeriş elədik üzü yuxarı...* N.Vəzirov.

◊ **Yerişini azdırmaq** – 1) yorğa gedən at haqqında; 2) *məc.* qudurmaq, lovğa olmaq, təşəxxüslü olmaq.

**YERİŞLİ** *sif.* ...kimi yeriyən, ...kimi (adətən tərkib halında). *Başında ağ şalı var; Yaşılı var, alı var; Ceyran yerişli yarın; Ağ buxaqda xalı var.* (Bayatı).

**YERKEŞNİŞİ** *is. bot.* Torpaqüstü hissələrində zəhər olan yabanı bitki.

**YERKÖKÜ** *is.* Sarı-qırmızı rəngli, getdikcə incə-uzunsov yeməli kökü olan tərəvəz bitkisi və bu bitkinin meyvəsi.

**YERQAZAN** 1. *sif.* Yer qazımaqla məşğul olan, torpaq işləri görən. *Yerqazan fəhlə. – Həqiqətin qırmızı yanağını toz basmış, başının tükləri bir neçə yerdən pırtlamış, özü isə*

*bikef halda dayanıb .. yerqazan yoldaşlarına baxırdı*. Ə.Vəliyev. // Yer qazıyan, torpaq qazıyan, torpaq çıxardan. *Yerqazan maşın.*

2. *is.* Yer qazımaqla məşğul olan işçi, torpaq işləri görən fəhlə. *Yerqazanlar yer qazırdılar.*

3. *is.* Yer qazımaq üçün lazım olan alət (külüng, bel və s.). *Yerqazanla yer qazımaq*.

**YERLƏŞDİRİLMƏ** "Yerləşdirilmək"dən *f.is.*

**YERLƏŞDİRİLMƏK** *məch.* 1. Bir yerə qoyulmaq. *Şeylərin hamısı yerləşdirilmişdir.*

2. Müvəqqəti və ya daimi qalmaq, yaşamaq, yerləşmək, sakin olmaq üçün bir yer verilmək. *Qonaqlar mehmanxanalarda yerləşdirildilər.*

**YERLƏŞDİRMƏ** "Yerləşdirmək"dən *f.is.*

**YERLƏŞDİRMƏK** *f.* 1. Bir şeyə bir yerdə yer etmək, bir yerə qoymaq, yerbəyer etmək. *Şeyləri çamadana yerləşdirmək. Kitabları şkaflara yerləşdirmək.*

2. Yaşamaq üçün bir yer vermək, bir yerdə sakin etmək. *Tələbələri yataqxanalarda yerləşdirmək. Bu evə neçə adam yerləşdirmək olar?* // Bir məqsəd üçün bir yerə qoymaq; düzəltmək. [Məsmə:] *Axırda* [ərimi] *xəstəxanaya yerləşdirmək fikrinə düşdüm, orada daha faydalı müalicə edilərdi.* S.Hüseyn.

3. Soxmaq, yeritmək.

**YERLƏŞMƏ** "Yerləşmək"dən *f.is.*

**YERLƏŞMƏK** *f.* 1. Bir sahəni, bir yeri tutmaq, mövqe tutmaq. *Yuxarıbazarda isə bəzzazlar, xalçaçılar yerləşmişdi*. H.Sarabski. *Rüxsarənin gözləri qarşısında dəniz sahilində yerləşən qocaman şəhər canlanırdı*. S.Rəhimov. *Güney yamaclarda yerləşən şəhər bu gün lap tez yuxudan qalxmışdı*. Mir Cəlal.

2. Bir yerdə qərar tapmaq, sakin olmaq, oturmaq, müvəqqəti və ya həmişəlik bir yerdə yaşamaq. *Nümayəndələr mehmanxanalarda yerləşiblər. Qərargah yeraltı qazmalarda yerləşdi. Səyyahlar bir çayın kənarında yerləşdilər.*

3. Sığmaq. *Bu qədər gilas bir səbətə yerləşməz. Mebel otağa zorla yerləşdi.*

4. Səliqəyə, nizama düşmək, yerbəyer olmaq. *Mallar qəfəsələrə yerləşdi*.

**YERLİ** *sif.* 1. Başqa yerdən gəlmə deyil, həmin yerdən olan, bu yerin əhalisindən olan. *Yerli əhali. Yerli camaat. Bizim yerli deyil*. // İs. mənasında. *Yerlilər və gəlmələr. Yerlilərə məxsus adət və ənənələr. Buranın yerliləri əkinçidir*. – [Südabənin anası:] *Südabə Həkimülmülkün qızı deyil. Bunun atası bizim öz yerlimiz, öz ellimiz idi.* M.İbrahimov.

2. Müəyyən yerə (şəhərə, ölkəyə və s.-yə) aid olan. *Yerli adətlər. Yerli ləhcə. Yerli cins mal-qara.* // Gətirilmə olmayan, həmin yerdə olan və ya hazırlanan. *Yerli mallar. Yerli yanacaq. Yerli xammal*. // Mərkəzi olmayan, ümumdövlət mahiyyəti daşımayan, yalnız müəyyən bir ərazi daxilində qüvvəsi, əhəmiyyəti olan. *Yerli təşkilatlar. Yerli büdcə. Yerli qəzet.*

3. Ümumi olmayan, bir şeyin yalnız bir hissəsinə, bir cəhətinə təsir edən. *Yerli iltihab. Yerli keyləşdirmə.*

4. Şəraitə tam uyğun olaraq edilən, məqamında, yerində olan; haqlı. *Yerli söz. Yerli göstəriş. – Babacanın məzəmməti bir az yerli və haqlı olduğundan Qumru pozuldu.* Ə.Əbülhəsən. □ **Yerli-yerində** – 1) hər şey və ya hər kəs öz yerində, qaydasında, tərtib və nizamla. *Hər şey yerli-yerindədir. Sinifdə şagirdlər yerli-yerindədir;* 2) bütün təfsilatı ilə, müfəssəl surətdə; 3) lazım gəldiyi yerdə, hər yerdə.

**YERLİÇİLİK** *is.* Ümumi işin zərərinə olaraq, öz yerlisini himayə etmə, ona üstünlük vermə (yalnız mənfi mənada işlənir). *Yerliçilik kimi mənfi halları aradan qaldırmaq*. // Bir işdə və s.-də yalnız öz yerinin mənafeyini güdmə. *Planlarımızda və işimizdə olan yerliçilik .. böyük işlərə ağır zərbədir*. Ə.Sadıq.

**YERLİ-DİBLİ** *zərf* 1. Bütünlükdə, tamamilə, kökündən. [Səkinə xanım:] *Mənim haqqım yerli-dibli batsa da, mən Ağa Həsənə gedən deyiləm!* M.F.Axundzadə. *Deyəcəkdim ki, Qaryagin mahalının qazısının işləri ya möcüzədir və ya yerli-dibli yalandır.* C.Məmmədquluzadə.

2. Qətiyyən, bilmərrə, əsla, heç. *Yerli-dibli xəbərim yoxdur. Yerli-dibli heç bir şey bilmir.*

3. İzsiz-soraqsız. *Məktəbli gənc yerli-dibli yox oldu*. Ə.Vəliyev.

**YERLİK** *is.* Döşəmə, yer. *Yerliyi darısqal, içi bürkülü; O qamış komalar bəs indi hanı?* S.Vurğun. // B a x **yer** 19-cu mənada. *Maral keçən il tikdirdiyi yerliyi ağ olan donunu götürdü*. Ə.Əbülhəsən.

◊ **Yerlik hal** *qram.* – ismin kimdə? nədə? və harada? suallarına cavab verən halı.

**YERLİ-KÖKLÜ** *zərf* Dibindən, kökündən, tamamilə, büsbütün, yerli-dibli. [Surxay:] *Allah onların yerli-köklü tifaqlarını dağıtsın.* S.Rəhman.

**YERLİLƏŞDİRİLMƏ** “Yerliləşdirilmək”-dən *f.is.*

**YERLİLƏŞDİRİLMƏK** *məch.* Yerli iqlimə, yerli şəraitə uyğunlaşdırılmaq; iqlimləşdirilmək. *Bir sıra meyvə növləri Miçurin tərəfindən soyuq iqlimdə yerliləşdirilmişdir.*

**YERLİLƏŞDİRMƏ** “Yerliləşdirmək”dən *f.is.*

**YERLİLƏŞDİRMƏK** *f.* Yerli iqlimə, yerli şəraitə uyğunlaşdırmaq; iqlimləşdirmək. // Bir yerin hökumət idarələrini, təşkilatlarını və s.-ni yerli əhalidən olan işçilər hesabına gücləndirmək, yerli əhaliyə yaxınlaşdırmaq. *İdarələri yerliləşdirmək.*

**YERLİLƏŞMƏ** “Yerliləşmək”dən *f.is.*

**YERLİLƏŞMƏK** *f.* Uzun müddət bir yerdə yaşayaraq onun yerli əhalisinin adət və ənənələrini, həyat tərzini, mədəniyyətini qəbul edib ondan seçilməz hala gəlmək; bir yerə isinişmək, uyğunlaşmaq.

**YERLİLİK** *is.* 1. Yerli olma, bir yerin sakini olma, bir yerə mənsubluq.

2. B a x **yerliçilik**.

**YERLİ-YATAQLI** *zərf* 1. Geniş, ətraflı, hərtərəfli, təfsilatı ilə. *Ballının yerli-yataqlı danışığı, köhnə kənd evlərini təsvir etməsi Budağı uzun müddət dərin fikirlərə qərq edirdi.* Ə.Vəliyev.

2. Çox böyük, yekə, qocaman. [Qaçaqlar] *yerli-yataqlı, şax-budaqlı qocaman bir çinarın dibində doyunca yeyib al şərabdan içmiş, yatıb xumarlanırdılar.* M.Rzaquluzadə.

3. Hamı birlikdə, köç-külfətli olaraq, bütün ailəsi ilə birlikdə. *Yerli-yataqlı gəlib.*

**YERLİ-YERSİZ** *zərf* Münasib, məqamında, yerində olub-olmadığını nəzərə almadan, düz olub-olmadığını bilmədən. *Yerli-yersiz irad tutmaq. Yerli-yersiz danışmaq. Yerli-yersiz tərifləmək.*

**YERÖLÇƏN** *is.* Mərz çəkmə, yer ölçmə mütəxəssisi. *Yerölçənlər gəlib, – deyə muzdur xəbər verdi.* Ə.Əbülhəsən. *Tamam şübhədən qurtarmaq üçün səhər yerölçəni göndərərəm, gəlib baxar.* Ə.Vəliyev.

**YERPƏNƏK** *is.* Xiyar. [Süleyman bəy:] *Yolda tor qurub beş-on bildirçin tutdum, budur torbada. Bir az şoraba üçün yerpənək almışam, gedirəm. Soruşdum: a kişi, heç əməlli bildirçinin varmı?* Ə.Haqverdiyev.

**YERPULU** *is.* Gecələmə haqqı, gecələmə yeri üçün verilən pul.

**YERSARMAŞIĞI** *is. bot.* Yerdə sürünən xırda açıq-göy və qırmızı, yaxud ağ çiçəyi olan çoxillik sarmaşıq bitkisi (alaq otu).

**YERSİZ** *sif.* 1. Yeri, məkanı olmayan, yeri-yurdu olmayan. *Yersiz adam.* // İs. mənasında. *Yersiz gəldi, yerli qaç.* (Məsəl).

2. Torpaqsız. *Yersiz kəndlilər.*

3. Yerində, məqamında olmayan; uyğunsuz, namünasib, münasibətsiz. *Yersiz söz. Yersiz söhbətlər. Yersiz danlaq.* – [Şərifzadə] *Mehribanı boşadığı üçün olduqca darılmış,* [Zeynalın] *belə yersiz hərəkətindən dolayı acıqlanmışdı.* S.Hüseyn. // Zərf mənasında. *Yersiz danlamaq. – Ev sahibinin qəribə bir ilhamla dediyi sözlər də mənə yersiz görünürdü.* M.Hüseyn. *Kazım müdirin hirslənməsini yersiz görüb təəssüfləndisə də, çıxıb getdi və güman etdi ki, məsələ bununla qurtardı.* Mir Cəlal.

4. Təsirsiz. *Müxbirin təklifi yersiz qalmadı.* Mir Cəlal.

5. Nahaq, əbəs, əsassız. *Yersiz nigarançılıq. Yersiz ehtiyat. Yersiz* (z.) *narahat olmaq.* – [Rüstəm:] *Xeyr, şahım, aldırma! Yersizdir bu iztirab; Rüstəm dursun, onlara; Səyavuş verir cavab.* H.Cavid. [Soltan:] *Sənin atan da, əmilərin də yersiz inadkarlıqdan həmişə zərər çəkiblər.* İ.Hüseynov.

6. Vəzifəsi, yeri olmayan; vəzifəsiz, işsiz. *Yersiz* (z.) *qalmaq.*

**yersiz-yersiz** *zərf* və *sif.* Namünasib, münasibətsiz, uyğunsuz. *Yersiz-yersiz danışmaq.* – [Veys] .. *sol əli ilə yersiz-yersiz hərəkətlər edirdi.* Ə.Əbülhəsən.

**YERSİZ-YURDSUZ** *sif.* Yaşamaq üçün yeri-yurdu olmayan, evsiz-eşiksiz; yersiz. // Səfil, avara.

**YERSİZ-YUVASIZ** *sif.* Yaşayış yeri olmayan; yersiz-yurdsuz. *Mədənlərdə, fabrik və zavodlarda işləyən fəhlələr, bəyin zülmündən və aclıqdan qaçıb iş axtarmağa gəlmiş kəndlilər, kasıblar, yersiz-yuvasız zavallılar burada – Çəmbərəkənddə yaşayırdılar.* S.Rəhman.

**YERTƏRPƏNMƏ** *is.* Zəlzələ.

**YERÜSTÜ** *sif.* Yerin, torpağın üst tərəfində. *Meşələr qarın tez əriməsinə mane olur, yerüstü suların axmasını azaldır ki, bu da rütubətin torpağa hopmasına səbəb olur.* M.Qaşqay.

**YERYAPALAĞI** *is. zar.* Boyca çox gödək adam haqqında. *Bu yeryapalağı kimdir?*

**YER-YEMİŞ** *top.* 1. Bostan meyvələri.

2. Xuşgəbar. *Yer-yemişin yedim mən; Ürək sözüm dedim mən; Heç Allaha rəvadır; Ağsaqqala gedim mən?* (Bayatı). *Bayrama yaxın neçə dəfə dövlətlilərin yanına gedib yer-yemiş istəmişdisə də, verməmişdilər.* C.Cabbarlı.

**YER-YER** *zərf* Müxtəlif yerlərdə, bəzi yerlərdə: orada-burada, adda-budda. *Buna pasyolka deyərlər, yer-yer; Doluşub qoynuna məxluq, ellər.* M.Müşfiq.

**YER-YERDƏN** *zərf* Müxtəlif yerlərdən, hər yerdən, hər tərəfdən. *Nə zaman getsə məclisə; Qovular, döyülər kasıb; Danışmağa ağız açsa; Yer-yerdən söyülər kasıb.* Aşıq Əhməd. *Yer-yerdən* [Əlisəfaya] *etiraz etdilər.* S.Hüseyn. *Ellərin üstünə düşüb yer-yerdən; Vurmaq istədilər bağrına yara.* S.Rüstəm.

**YER-YURD** *is.* Yaşayış yeri, bir adamın olduğu yaşadığı yer, vətəni; ümumiyyətlə, yer. *Yeri-yurdu məlum deyil.* – [Nəbi:] *Bəylərin yer-yurdu od tutub yansın; Buraxmayın bir təkini bəylərin!* "Qaçaq Nəbi". *Dağların başında gurultu güclənir, ildırım şaqqıldayır, yeri-yurdu tərpədirdi.* S.Rəhimov.

**YESİR** b a x **əsir**. *Yalan yoxdur, bir az səndən kəsirəm; O səbəbdən məhlənizdə yesirəm.* Aşıq Ələsgər. [Şamama Cadu:] *Ev nədir, eşik nədir, sənə yesir olum, bir daxması var, iki hin kimi otaqdır.* Ə.Haqverdiyev.

**YESİRLİK** b a x **əsirlik**.

**YEŞİK** [*rus.*] Taxtadan və s.-dən qayrılan iri qutu. *Meyvələri yeşiklərə yığdılar. Üç yeşik alma.* – [Ağa:] *Bir uca ağacın baş budağına bir yeşiyi kəndir ilə möhkəm bağlayıb Molla Nəbiqulunu əyləşdirdim yeşiyin içində..* Ə.Haqverdiyev. *Şofer bir yeşik üzüm və bir yeşik əncir gətirdi.* Ə.Əbülhəsən.

**YEŞİKÇİ** *is.* Yeşik qayıran usta.

**YEŞİKÇİLİK** *is.* Yeşikçinin işi, peşəsi, sənəti.

**YEŞİKDAŞIYAN** *sif.* Yeşikləri daşıyan (fəhlə, işçi).

**YEŞİKLİ** *sif.* Yeşiyi və ya yeşikləri olan. *Yeşikli stol.*

**YEŞİKLİK** *sif.* 1. Yeşiyə yarayan. *Yeşiklik taxta.*

2. Adətən saylarla – ... yeşiyə yetəcək qədər. *Bir yeşiklik taxta.*

**YETDİK** *sif.* 1. Çatacaq qədər, kifayət edəcək qədər. *Bir stəkan çaya yetdik qənd ayırdı. Bir günə yetdik çörək.*

2. Çatası, çatmalı olan. *Sinəmdə sizə yetdik; Mənim bir az sözüm var.* R.Rza.

**YETƏN: hər yetən** – hər kəs, hər adam, hər biri. *Hər yetən gözələ gözəl demərəm; Gözəldə bir qeyri əlamət olur.* M.P.Vaqif. [Həcər xanım:] *Mən Həcərəm, əbrü ətlas geymərəm; Hər yetən gədayə boyun əymərəm.* Aşıq Ələsgər. *Cümə deyər, hər yetənə sirr vermə; Dost, mehriban ya bir olur, ya iki.* Molla Cümə.

**YETƏR** 1. *sif.* Bəs olan, kifayət edən. *Bağları yetər qədər üzüm verir. Bütün ilə yetər taxılı var.*

2. *Əmr mənasında.* Bəsdir, kifayətdir! *Yetər, ağlama! Yetər, canım!* ☐ **Artıq yetər** – daha bəsdir, kifayətdir, daha lazım deyil.

3. *Xəbər mənasında.* Bəs edər, çatar, kifayət olar. *İşlədik, yetər. Taxıl bir ilə yetər. Çörəyimiz iki günə yetər.*

**YETƏRLİK** *sif.* Kafilik, bəslik. *Bir xəmirə yetərlik unumuz qalmışdır.*

**YETİK** *sif.* 1. Bələd, tanış, xəbərdar, vaqif, yaxın. *Ələsgərəm, mən yetiyəm hər işə; İki könül bir-biriynən barışa.* Aşıq Ələsgər. [Sona:] *Görmüşəm, sifətdən gözəldir, ancaq təbiətini bilmirəm, anam onlara çox yetikdir.* A.Şaiq.

2. Yetişmiş, yetkin. *Yetik yelinli mayalar isə ehtiyatla, tələsmədən yeriyib sallana-sallana sürünün dalında gəlirdi.* M.İbrahimov.

**YETİKLİK** *is.* 1. Yetik olma, xəbərdar olma; bələdlik, yaxınlıq.

2. Yetkinlik.

**YETİM** *sif.* 1. Atası-anası, yaxud atası və ya anası ölmüş. *Yetim uşaq. Atadan yetim qız.* – *Qürbət içrə fəhləliklə saxlar idi öz başın; Həm vətəndə dul anasın, yetim bacı, qardaşın.* A.Səhhət. // İs. mənasında. *Yetimə can-can deyən çox olar, çörək verən az.* (Ata. sözü). *Yetim malına göz dikdiyin nədir daim; Həlal kəsb məgər narəvadır, ey vaiz?* S.Ə.Şirvani. *Yetimlər məlul-məlul Aslanın əlinə baxdılar.*

C.Cabbarlı. *Bu gün isə Hüseyn artıq arxasız və kimsəsiz bir yetimdir*. S.Rəhman. □ **Atadan (anadan) yetim** – atası (anası) ölmüş. *Bu iki uşaq atadan yetim idi .. və ataları bunlara bir şey qoymamışdı.* S.S.Axundov.

2. *məc.* Fağır, yazıq, aciz, zavallı, miskin mənasında. [Əsgər:] *Bircə deyin görüm, mən yetimin təqsiri nədir?* N.Vəzirov. *Bu gün gördüm ki, yetim iranlılar sevincək qaçırlar konsulxanaya ki, .. məşrutənin təzə elan olunmağı barəsində konsula mübarəkbadlıq versinlər.* C.Məmmədquluzadə. *İndi bəlkə mən yetimin də günü ağardı, – deyə, Səməd pıçıldadı.* İ.Hüseynov.

◊ **Yetim segah** – Azərbaycan muğamlarından birinin adı. *Fışqırıq çala-çala, dodaqaltı yetim segah oxuya-oxuya malı sahmanladı.* Mir Cəlal. **Yetimlər evi** *köhn.* – b a x **yetimxana**.

**YETİMCƏSİNƏ** *zərf* Yetim kimi; zavallıcasına, yazıq-yazıq, məzlum-məzlum, fağırfağır.

**YETİMCİYƏZ** *is.* "Yetim"dən *oxş.*

**YETİMÇƏ** 1. "Yetim"dən *kiç.* və *oxş.*

2. *is.* Bəzən təhqir, söyüş məqamında. *Yamacın yetimçəsi mənə qalmayıb, – deyə* [Əlləzoğlu] *kinli-kinli söylənirdi*. İ.Hüseynov.

**YETİMÇİLİK** b a x **yetimlik**. [Kərim xan] *iyirmi yaşı olar-olmaz özü kimi yetimçilikdə böyümüş Xavər adlı yoxsul, lakin yaraşıqlı və nəcib təbiətli bir qızla evlənmişdi*. M.İbrahimov. *Məni yetimçiliklə saxlayıb, adam eləyib kişilər cərgəsinə çıxardığını demədin..* Ə.Vəliyev.

**YETİMDAR** *sif.* Yetim uşaq saxlayıb böyüdən, yetim uşaq saxlayan. [Murad] *Nigarı alacaqdı. Onun yaşının azlığı, özünün yetimdar bir kişi olması əhəmiyyətsiz şeylərdi.* S.Hüseyn.

**YETİMDARLIQ** *is.* Yetim uşaq saxlayıb böyütmə, yetim uşaq saxlama.

**YETİMDOYURAN** *sif. dan. zar.* Yekə, iri (qab, boşqab haqqında). // İs. mənasında. [Almaz:] *Bu heç adamın boğazını da yaşlamaz ki, yetimdoyuranı gətir.* N.Vəzirov.

**YETİMXANA** *is.* Atasız-anasız, kimsəsiz qalmış uşaqlara məxsus xeyriyyə müəssisəsi. *Bülənd bütün bunlara baxır, yetimxananı tezliklə yorğan-döşəklə də təmin etmək lazım olduğunu düşünürdü; çünki yetimxananın açılması bundan asılı idi.* Ə.Əbülhəsən.

**YETİMLƏŞMƏ** "Yetimləşmək"dən *f.is.*

**YETİMLƏŞMƏK** *f.* Yetim olmaq, ata və ya anası ölmək.

**YETİMLİK** *is.* Ata-anası olmayan uşağın halı, vəziyyəti. *Yetimlik çəkmək. – Yetimliyi halətindən bəllidir; Fəqirliyi zillətindən bəllidir.* A.Səhhət. *Biz ki yetimliklə böyüdük qoşa; Birgə qonaq getdik yara, yoldaşa*. S.Vurğun. *Durnanın yetimlik, yalqızlıq iztirabları ilə pərvəriş tapmış qəlbi bu sakit sevginin sadə, mehriban axşamları ilə bəxtiyar idi*. İ.Əfəndiyev.

**YETİM-YESİR** *top. dan.* 1. Atasız-anasız uşaqlar, yetimlər. [Məşədi Cəfər:] *Məndən sonra bir bölük yetim-yesir qalacaq*. Ə.Haqverdiyev.

2. *məc.* Yoxsullar, məzlumlar, evsiz-eşiksizlər. *Amma bunu da biliniz, ey mollalar ki günlər dolanar, ..zəmanə təzələnər və axırda yetim-yesir və keçəl-küçəl qardaşlarım dostu ilə düşməni tanıyıb haman yoğun dəyənəkləri sizin əlinizdən alar..* C.Məmmədquluzadə. *Külək əsir, şaxta kəsir; Nalə çəkir yetim-yesir.* S.Rüstəm. *Murad camaat içində açıq-açığına danışırdı ki, "Şura hökuməti hamıya əl-qol verib, dil-ağız verib, kasıb-kusub, yetim-yesir adam olub, adam içinə çıxır...*". İ.Hüseynov.

**YETİRİCİ** *sif.* Yetirən, verən, yetişdirən, hasiledici. *..Ziyadə məhsulat yetirici və meyvəcat yetirici yerlərdə əhali elmsizlik cəhətindən fəqir və zillətdə dolanmaqdadırlar.* F.Köçərli.

**YETİRİLMƏ** "Yetirilmək"dən *f.is.*

**YETİRİLMƏK** *məch*. Çatdırılmaq.

**YETİRMƏ** 1. "Yetirmək"dən *f.is.*

2. *is.* b a x **yetişdirmə** 2-ci mənada. *O, kimin yetirməsidir? – Guya bütün salamabadlılar öz yetirmələrinə məktəb düzəldəcəklər.* Mir Cəlal.

**YETİRMƏK** *f.* 1. Bir şeyi, yaxud bir sözü (xəbəri, məlumatı) başqa bir kəsə və ya yerə hər hansı bir vasitə ilə çatdırmaq. *Məktubu sahibinə yetirmək. Məndən ona salam yetir. – Şah Abbas o saat əmr elədi, lazımi xəbəri firəng elçilərinə yetirdilər.* M.F.Axundzadə. *Qasıməli kirvə, əlbəttə, bizə gərək iki pud xalis inək yağı gətirəsən, amma üç həftəyədək gərək yetirəsən.* C.Məmmədquluzadə.

2. Özünü gedən, ya qaçan birisinə, yaxud da bir yerə çatdırmaq (adətən "özünü" sözü ilə). *Özünü tez evə yetirdi. Özünü qabaqdakılara yetirmək. – Əgər Nəbi bu gün özünü Gorusa yetirə bilməsə, sabah Həcər öləsi idi.* "Qaçaq Nəbi". *Bu vaxt Elman özünü yetirdi.* M.Hüseyn.

3. Tərbiyə və təlim edib böyütmək, ortaya çıxarmaq (bəzən "böyüdüb-yetirmək" şəklində). *Yaxşı övlad yetirmək. – Qafar .. İkram və Fatma kimi zehinli, ləyaqətli uşaqlar böyüdüb-yetirən arvadına güldən ağır söz deyilməsinə dözməyəcəkdi.* Ə.Əbülhəsən. // Qulluq edərək böyütmək; becərmək, yetişdirmək, yaratmaq. *Bağban bağında yeni meyvə növləri yetirmişdir. – Cəfa çəkdim, bağ yetirdim; Gülşəni xarə tapşırdım; Bunca fikrü xəyal etdim; Tapmadım çarə, tapşırdım.* Q.Zakir.

4. Bir sıra sözlərə qoşularaq, müxtəlif frazeoloji ifadələr düzəldilir; məs.: diqqət yetirmək, dil yetirmək, göz yetirmək, yerinə yetirmək.

**YETİŞDİRİLMƏ** "Yetişdirilmək"dən *f.is.*

**YETİŞDİRİLMƏK** *məch.* Becərilmək, bəslənib böyüdülmək; vücuda gətirilmək. *Bağlarda dadlı meyvələr yetişdirilir.* // Tərbiyə edilib meydana gətirilmək, ortaya çıxarılmaq; hazırlanmaq, yaradılmaq. *Ali məktəblərimizdə müxtəlif sahələrə aid mütəxəssis yetişdirilir.*

**YETİŞDİRMƏ** 1. "Yetişdirmək"dən *f.is.*

2. *is.* Biri tərəfindən tərbiyə və təhsil verilib yetişdirilmiş adam. *Universitetin yetişdirməsi. O, məşhur alimin yetişdirməsidir. Bizim institutun yetişdirməsidir. – Mirzə Valehin yetişdirməsi olan gənc Adil də hər kəsi öz fəsahət və bəlağəti ilə təəccübləndirirdi.* S.Rəhimov.

**YETİŞDİRMƏK** *f.* 1. B a x **yetirmək**. *Cavan meyvə ağacları yetişdirmək. Yeni kadrlar yetişdirmək. – Mehriban dindar, əski bir müsəlman ailəsinin tərbiyə edib yetişdirdiyi bir qızdı.* S.Hüseyn.

2. Çatışdırmaq, öhdəsindən gəlmək, vaxtında görə bilmək. *Bu qədər işi yetişdirmək mümkün deyil.*

**YETİŞHAYETİŞ** *is.* 1. Çatmaq, yetişmək, yaxınlaşmaq üzrə olma. [Tərlan] *kolxoz idarəsinə yetişhayetişdə çevik addımlarla gələn bir nəfərlə qarşılaşdı.* M.Hüseyn.

2. Yetişmək, dəymək üzrə olma (meyvələr haqqında).

**YETİŞKƏN** *sif.* Yaxşı yetişmiş, lap dəymiş. *Yetişkən meyvə.* // İs. mənasında. *Tutun yetişkənlərindən dər.*

**YETİŞKƏNLİK** *is.* Yetişmiş, dəymiş meyvənin halı.

**YETİŞMƏ** "Yetişmək"dən *f.is.*

**YETİŞMƏK** *f.* 1. Bir istiqamətdə gedərək nəzərdə tutduğu bir yerə çatmaq, yetmək, varmaq, varid olmaq. *Yüzbaşının çavuşu Nəzərəli at üstə, çaparaq yetişər xərmənə.* C.Məmmədquluzadə. [Hacı:] *Kəndə yetişəndən sonra Almaz uzunboğaz çəkməsini keçi piyi ilə yağlayıb işıldadır.* S.Rəhimov. // Özünü çatdırmaq, vaxtında çatmaq. *Millət boğulur, .. əgər dadü fəryada tez yetişməzsə, mümkündür ki, millətdən bir əsər dəxi qalmaya..* C.Məmmədquluzadə. *Knyazın ordusu yetişib həmən; Bürümüş şəhəri dörd bir tərəfdən.* S.Vurğun. // Bir istiqamətdə hərəkət edərək bir yerə çatmaq (qatar, gəmi, maşın və s. haqqında). *Qatar stansiyaya yetişdi. Biz sahilə yetişdik.* // Göndərilən ünvana, yerə, şəxsə çatmaq; yerinə, sahibinə çatmaq; yetmək. *Üç gün əvvəl göndərilən məktub bu gün yetişdi. Teleqram nədənsə sahibinə yetişməyib.* // Gəlib çatmaq; bilinmək. *Xəbər nə vaxt yetişdi? Məlumat hələ yetişməyib.*

2. Qovuşmaq, birləşmək. *Əziziyəm, yar yara; Qara bağrım yar yara; Ürək titrər, qan qaçar; Yetişəndə yar yara.* (Bayatı). *Yüz hüsn dilü dideyi-heyranə yetişməz; Yüz gənc həqiqətdə bu viranə yetişməz.* Qövsi.

3. Çatışmaq, yetmək, çatmaq. *Elə qaçırsan ki, sənə yetişmək olmur. Yoldaşıma yetişdim. Qatara yetişə bilmədim.*

4. Müəyyən bir həddə, yaşa çatmaq. [Rzaqulu xan] *28 sinnə yetişdikdə Sorbon darülfünunun hüquq şöbəsindən qızıl nişan və iftixar ilə məzun olmuşdur.* M.S.Ordubadi. // Büluğa çatmaq, böyümək. *Yetişibsən, indən belə yaraşmaz; Yadlar ilə deyib-danışmaq sənə.* Q.Zakir. *Uşaqlarımız oxuyur, cavanlarımız yetişir, qoy ürəkaçan bir yer olsun, özü də istəyirəm ki, məndən sonraya bir yadigar qalsın!* S.Rəhimov. *Buğa yetişən kimi oğlan yenə onun buynuzlarından yapışdı.* M.Rzaquluzadə. // Yetkinləşmək, təcrübə qazanmaq, bişmək. *Biz döyüşdə yetişmişik.* Z.Xəlil.

5. Bitmək, vücuda gəlmək, hasil olmaq (bitki haqqında). *Abşeronda zeytun çox yaxşı yetişir. – Elə subtropik bitki yoxdur ki, Azərbaycanda yetişməsin.* İ.Əfəndiyev.

6. Dəymək, yeməli hala gəlmək. *Meyvələr yaxşı yetişib. Üzümlər çoxdan yetişib.* – [Əyyar:] *..Şitillər böyüyər, bağım bağ olar; Meyvələr yetişər, kefim çağ olar.* A.Şaiq. [Hacı Murad:] *Yox, oğlum, dəymə, yetişəndə yığıb sənə göndərəcəyəm.* S.S.Axundov. // İşlənmək üçün hazır vəziyyətə gəlmək. *Pendir yetişib, yemək olar.*

7. Kifayət etmək, kafi olmaq; çatmaq. *Bu ət beş nəfərin xörəyinə yetişməz. Çörək hamıya yetişər.*

8. Gəlib çatmaq, yaxınlaşmaq. [Bəypolad:] *Əfsus ki, şərəfi-müsahibətinizdən məhrum olmaq zamanı yetişdi.* H.Cavid.

9. Tay olmaq, bərabər olmaq, çatmaq (adətən inkarda işlənir). *Eşq atəşi bir od salıb canıma; Yanmaqda yetişməz səməndər mənə.* Q.Zakir.

10. **Yetişir, yetişər** şəklində – bəsdir, yetər, kifayətdir. [Cəmil bəy:] *Yetişir, Humay, yetişir! Yaralı könlümə buraxmış olduğun yanğını, əmin ol ki, dəryalar belə söndürməz.* H.Cavid. [Nüşabə:] *Yetişir, bizdə əzizdir qonşu; Düşünün bir, nə zarafatdır bu?* A.Şaiq.

**YETİŞMİŞ** *sif.* 1. Dəymiş, yeməli hala gəlmiş. *Yetişmiş meyvə. Yetişmiş üzüm.* // İşlənmək, yeyilmək, istifadə edilmək üçün hazır olan; gəlmiş. *..Pendir saxlananda onun kazeininin bir hissəsi dönüb piy və ətirli yağ olur ki, belə pendirə yetişmiş pendir deyilir.* H.Zərdabi.

2. Böyümüş, bülüğa çatmış. *Onun yetişmiş uşaqları var.* // Ərə getmək vaxtı çatmış. *Sözüm buradadır ki, bu axır vaxtlarda bizim yetişmiş qızlarımıza ər tapılmır.* C.Məmmədquluzadə. [Xırda xanım:] *..Özün bilirsən, şəhərimizdə bu saat yetişmiş qız çoxdur.* N.Vəzirov.

**YETKİN** *sif.* 1. Hər cəhətdən yetişmiş, kamilləşmiş, təcrübəli. *Yetkin adam. Yetkin mütəxəssis. Yetkin sənətkar. – Əsgər rayon mərkəzinə yola düşəndə fikirləşir və bu qərara gəlirdi ki, o bir mütəxəssis olaraq hələ yetkin deyil.* Ə.Vəliyev. [Sultan əmi] *özünü doğrudan da yetkin bir kişi kimi hiss etmişdi.* İ.Hüseynov.

2. Dəymiş, yetişmiş, yetişkən. *Yetkin taxıl. – Ağ tutun yetkinlərindən biri düşdü qabağımdakı stəkanın yanına..* C.Məmmədquluzadə. *Çıxma ərik ağacına, bihudə, dilbərim; Yen gəl aşağı, nə yetkini var, nə xami var.* M.Möcüz.

**YETKİNLƏŞMƏ** "Yetkinləşmək"dən *f.is.*

**YETKİNLƏŞMƏK** *f.* 1. Yetkin hala gəlmək, təcrübələnmək, kamilləşmək; daha yetkin olmaq.

2. Dəymək, yetişmək (meyvə, taxıl).

**YETKİNLİK** *is.* 1. Təcrübəlilik, kamillik. ["Dəli Kür"] *..əsərin toxumu İ.Şıxlının qan yaddaşında həmişə mövcud olub, sadəcə, əlverişli şərait yarananda – oyanıb, Şıxlı da onu qələmə alıb; xoşbəxtlikdən bu, onun sənətkar kimi yetkinlik dövrünə təsadüf edib.* İ.Qasımzadə.

2. Yetişmiş, dəymiş meyvənin halı.

**YETMƏ** 1. "Yetmək"dən *f.is.*

2. *sif.* Yetişmiş, yetkin. *Gölə cumar yaşılbaşlı sonalar; Əcəb yetmə gözəl bəslər analar.* Aşıq Kərəm.

**YETMƏK** *f.* 1. Bax **yetişmək** 3-cü mənada. *Pul sənə yetdimi? Məktub sahibinə hələ də yetməmişdir. Sənə yetmək olmur. – Yetənə yetir, yetməyənə daş atır.* (Ata. sözü). *Yar gələr, yara yetməz; Sonalar sara yetməz; Pis gündən qurtarmağa; Ağlamaq çarə etməz.* (Bayatı).

2. Gəlmək, keçmək, çatmaq. *Demə ki, nədir bu macəralar! Səndən mənə yetdi bu bəlalər.* Füzuli. // Gəlib çatmaq, yaxınlaşmaq, ardınca gəlmək. *Yanvar ayı keçib getmiş; Sonra yetir fevral ayı.* M.Dilbazi.

3. Çatmaq, kifayət etmək. *Zeynal sərxoşluğundan müvazinətini saxlaya bilmədiyi üçün Mehribana gücü yetmirdi.* S.Hüseyn.

4. Toxunmaq, rastlaşmaq, dəymək. *Pərvanə yaxar var-yoxunu bir oda yetsə; Razı deyiləm kim, mənə pərvanə desinlər.* Qövsi.

5. **Yetər** şəklində – bəsdir, kifayətdir. [Ana:] *Yox, qardaşım, birini dartıb qərib vilayətə apardığın yetər, daha bunu verməərəm.* S.S.Axundov. *Yetər bu qədər danışdığımız. Artıq iş zamanıdır.* C.Cabbarlı.

**YETMİŞ** 1. Altmış doqquzdan sonra gələn say – 70. *Yetmişdə yeddi onluq var. Yetmiş manat. Yetmişə yaxın adam.*

2. *is.* Yetmiş yaş. *Yetmişi keçmişdir.*

**YETMİŞİLLİK** 1. *is.* Yetmiş il davam etmiş dövr, ömür. *Yetmişilliyini bayram etmək. Yetmişilliyi münasibəti ilə gələn təbriklər. Şairin yetmişilliyi.*
2. *Sif. mənasında.* Yetmiş il davam etmiş, yetmiş il sürmüş. *Yetmişillik bir ömür. Məsələnin yetmişillik tarixi var.*
**YETMİŞİNCİ** "Yetmiş"dən *sıra s.*
**YETMİŞLİK** *sif.* Yetmiş yaşında. *Yetmişlik bir qarı.*
**YETMİŞYAŞLI** *sif.* Yetmiş yaşında olan. *Yetmişyaşlı qoca. Yetmişyaşlı qadın.*
**YEY** [*qəd.*] b a x **eyi**. *Əgərçi bir neçə gün xar zəhmətin çəkdin; Vəli yey oldu günün-gündən ey həzar, bu il.* Qövsi. *Ayrılıqdan ölüm yeydi; Yar həsrəti qəddim əydi.* Aşıq Ələsgər.
**YEYƏ**[1] *is.* Metalı yonmaq, təmizləmək üçün üzəri diş-diş olan polad alət; suvand, törpü. *İnşaata gələndə yeyəni tutmağı bacarmayan .. İbrahimə ustası mürəkkəb bir hissə göstərdi.* Mir Cəlal.
**YEYƏ**[2] b a x **yiyə**.
**YEYƏCƏK** *is.* Yeməyə yarayan hər şey, yeyinti şeyləri, azuqə, ərzaq məhsulları. *Yeyəcək ehtiyacı. Yeyəcək vermək.*
**YEYƏCƏKSİZ** *sif.* Qidasız, yeməksiz, azuqəsiz, yeyintisiz. *Yeyəcəksiz* (z.) *qalmaq*.
**YEYƏCƏKSİZLİK** *is.* Yeyəcəyin olmadığı hal; azuqəsizlik.
**YEYƏLƏMƏ** "Yeyələmək"dən *f.is.*
**YEYƏLƏMƏK** *f.* Yeyə ilə yonmaq, sürtüb nazikləşdirmək və ya təmizləmək (metalı). *Dəmiri yeyələmək*.
**YEYƏLƏNMƏ** "Yeyələnmək"dən *f.is.*
**YEYƏLƏNMƏK** *məch.* Yeyə ilə yonulmaq, sürtülüb nazikləşdirilmək, təmizlənmək.
**YEYƏLƏTMƏ** "Yeyələtmək"dən *f.is.*
**YEYƏLƏTMƏK** *icb.* Yeyə ilə yondurmaq, yeyə ilə sürtdürüb nazikləşdirmək, təmizlətmək. *Açarı bir qədər yeyələtmək lazımdır.*
**YEYİB-İÇMƏ** "Yeyib-içmək"dən *f.is.*
**YEYİB-İÇMƏK** *f.* 1. Qidalanmaq, yaşamaq üçün qida qəbul etmək. [Hacı Murad:] *Öz yeyib-içməyiniz az idi, bunlar da artdı.* S.S.Axundov. [Şeyda:] *..Böylə heyvancasına yeyib-içmək, çalışıb-çapalamaq neçin?!* H.Cavid. [Gülsənəm] *axır vaxtlar nə yeyib-içdiyini də bilmirdi*. M.Hüseyn.
2. *məc*. İşrətlə, keflə məşğul olmaq. *Dostları da bir-birlərinə göz vurub onu göylərə qaldırar, sağlığına yeyib-içib dağılardılar*. S.Rüstəm. *..Yeyib-içən bir dəstə kefli Cumanın nəzərini cəlb etdi*. Ə.Əbülhəsən.
**YEYİB-YATMAQ** *f.* Heç bir işlə məşğul olmamaq, tüfeyli həyat keçirmək. [Əsgər:] *Yaxşı, indi bu sağ və salamat cavan bəs neyləsin, elə yeyib-yatsın?!* Ü.Hacıbəyov.
**YEYİCİ** *is.* və *sif.* 1. Yeyən, qidalanan, yemək alan. *Yeyicilərin sayı*.
2. B a x **yeyimcil**.
3. Kimyəvi cəhətdən pis təsir edən; pozucu, dağıdıcı. *Yeyici maddə. Yeyici turşular. – Gildə qumun miqdarı artdıqca, onun özlülüyü və plastikliyi azalır, yeyici xassələri isə artır*. S.Quliyev.
**YEYİCİL** b a x **yeyimcil**.
**YEYİCİLİK** *is.* 1. QarınquluLuq, yeyimcillik.
2. Kimyəvi cəhətdən pis təsir etmə, pozuculuq, dağıdıcılıq xassəsi. *Turşuların yeyiciliyi*.
**YEYİLMƏ**[1] "Yeyilmək"dən *f.is.*
**YEYİLMƏ**[2] *is. məh.* Ən çox üzə çıxan pis yara, dəri vərəmi, qurdöşənəyi.
**YEYİLMƏK** *məch.* 1. Ağızda çeynəyib udulmaq, mədəyə ötürülmək. *Çörək yeyilmək. Xörək yeyilmək. Yemək yeyilmək. – Mirzənin atasının evində nahar yeyilirdi.* Ə.Haqverdiyev.
2. Yeməyə sərf edilmək; işlədilmək. *Evimizdə çox şəkər yeyilir.*
3. Xarici təsir nəticəsində forması, bəzən də tərkibi dəyişilmək, sürtülüb getmək. *Gülnaz saxsı bardaqdakı qatıqdan mis kasaya töküb ucu yeyilmiş taxta qaşıqla çalxalamağa başladı.* M.İbrahimov. *İşlənmiş baltanın pərləri yeyildikdə onları yenidən metal elektrod vasitəsilə bərpa edirlər*. S.Quliyev.
4. *məc. dan.* Mənimsənilmək.
**YEYİM** b a x **yeyimlik**.
**YEYİMCİL** *sif.* Çox yeyən, yeməyi çox sevən, qarınqulu. *Yeyimcil adam.*
**YEYİMCİLLİK** *is.* Yeyimcil adamın hal və keyfiyyəti.
**YEYİMLİ** *sif.* Yaxşı yeyən, yeməyi yaxşı olan yeyimli adam.
**YEYİMLİK** *is.* Bir dəfə yeməyə çatan miqdar. *Bir yeyimlik çörəyimiz qalıb.*
**YEYİN** *sif.* Tez, cəld, iti, sürətli, itigedən. *Yeyin at özünə qamçı vurdurmaz*. (Ata. sözü).

// Zərf mənasında. *Söhbətin lap şirin vaxtı idi, sol səmtdən, döngədən bir şəxs çıxıb, yeyin yeriyib, kətdilərin yanına gəlib, salam verib üzünü tutdu Məhəmmədhəsən əmiyə.* C.Məmmədquluzadə. [Qulam:] *Durun bir nəfəsimi dərim. Yeyin gəlmişəm.* C.Cabbarlı.

**yeyin-yeyin** *zərf* Tez-tez, cəld-cəld, iti-iti, sürətlə. *Yeyin-yeyin yazmaq. – Bu dağ mənim, o dağ sənin; Yem toplardı yeyin-yeyin; Döşlərinə süd yığardı; Buynuzuna ot yığardı.* M.Müşfiq. *Gecə keçir... Mən gedirəm yeyin-yeyin; Səyyah deyil, bu şəhərin öz səsiyəm.* S.Vurğun. *Şığıdıqca göy üzündə gözəl yurdun tərlanları; Yeyin-yeyin vurur qızıl Abşeronun qan damarı.* R.Rza.

**YEYİNLƏMƏ** "Yeyinləmək"dən *f.is.*

**YEYİNLƏMƏK** *f.* İti (tez, cəld, sürətli) addımla yerimək, addımlarını sürətləndirmək. *Qoca daha da yeyinlədi. Baxdı ki, yox, bu dəfə səs lap qulağının dibindən gəlir.* (Nağıl). *Səlim gələn tərəfdən dalbadal üç güllə atıldı. Kəşfiyyatçılar yeyinlədilər.* Mir Cəlal.

**YEYİNLƏŞDİRİLMƏ** "Yeyinləşdirilmək"-dən *f.is.*

**YEYİNLƏŞDİRİLMƏK** *məch.* Sürəti artırılmaq, daha da sürətləndirilmək, cəldləşdirilmək.

**YEYİNLƏŞDİRMƏ** "Yeyinləşdirmək"dən *f.is.*

**YEYİNLƏŞDİRMƏK** *f.* Daha da sürətləndirmək, sürətini artırmaq; yeyinlətmək. *Xanpəri addımlarını yeyinləşdirdi.* Ə.Vəliyev.

**YEYİNLƏŞMƏ** "Yeyinləşmək"dən *f.is.*

**YEYİNLƏŞMƏK** *f.* Sürətlə gəlmək, yerimək, yeyin-yeyin irəliləmək. *Ağqanadlı göy ləpələr hürkmüş ördəklər kimi süzərək quruya doğru yeyinləşir.* Mir Cəlal.

**YEYİNLƏTMƏ** "Yeyinlətmək"dən *f.is.*

**YEYİNLƏTMƏK** *f.* Sürətini artırmaq, daha da sürətləndirmək, cəldləşdirmək. *Birdən Qərənfil addımlarını yeyinlətdi.* M.Hüseyn.

**YEYİNLİK** *is.* Bir şeyin hərəkətində sürətlilik, itilik, cəldlik. *Yerişin yeyinliyi. İşdə yeyinlik. Maşının hərəkətinin yeyinliyi. – Təkər yuxarıya ağır-ağır çıxır, ancaq enişə firlananda yeyinliyindən qabağında durmaq olmur.* S.Rəhimov.

**YEYİNTİ** *is.* 1. Yeməyə yarayan şeylər, yemək şeyləri, azuqə, yeyəcək şey. [Molla Zaman:] *Dur, arvad, gör bu corabları üç-dörd manata sata bilərsənmi? Bir az yeyinti al, gətir.* Ə.Haqverdiyev. ☐ **Yeyinti məhsulları** – yemək üçün hasil edilən məhsullar, yeyəcək şeyləri. **Yeyinti sənayesi** – yeyinti məhsulları, yemək şeyləri istehsal edən sənaye.

2. Mal-qara yeminə yarayan ot, küləş və s.

3. *məc.* Dövlət, yaxud xalq malını, pulunu mənimsəmə, oğurlama, israf etmə; israf. *Yeyinti demək azdır, talan var, lap belə yekə talan! – deyə Salman ağızdolusu səsini ucaldaraq söyləndi.* M.İbrahimov.

**YEYİTMƏ** b a x **yeyilmə**[2]. *Tənbəllik yeyitmə azarı kimi bir şeydir.* Ə.Sadıq.

**YEYRƏK** "Yey"dən *üst. dər. qəd.* Daha eyi, daha yaxşı, daha gözəl. *Bağiban, gər meyl qılmam sərvinə, məzur tut; Sərvdən yeyrək gəlir ol qaməti-mövzun mana.* Füzuli.

**YEZDAN** *is.* [*fars.*] *klas.* Yaradan, Allah, Tanrı. *Mən bülbüləm, gülşən olur məkanım; Açılmamış soldu gülü gülşanım; Bəxti qara yazan günü yezdanım; Qələm alıb yazan yerdir bu yerlər.* Aşıq Bülbül. *Məni sənə qismət eyləmiş yezdan; Aman Kərəm, məni rüsvay eyləmə.* "Əsli və Kərəm".

**YEZİD** [*ər. xüs. is.*-dən] Zalım, qəddar, insafsız, əzazil (bəzən söyüş məqamında). *Bu yezid oğlu yezid gərək elə mənim eşşəyimi gəlib aparaydı ki, başıma bu qədər qalmaqal gəlsin?* C.Məmmədquluzadə.

**YEZİDİ**[1] *is.* [*ər.*] İraqın Mosul tərəflərində yayılmış bir məzhəb və bu məzhəbə mənsub adam.

**YEZİDİ**[2] *sif.* [*xüs. is.*-dən] *köhn.* Qırmızı. ☐ **Yezidi qırmızı** – tünd-qırmızı. *Yezidi qırmızı parça.*

**YEZİDLİK** *is.* [*xüs. is.*-dən] Zalımlıq, qəddarlıq, insafsızlıq, pislik.

**YEZNƏ** *is.* 1. Bacının əri. *Onunçun da, doğrusu, yeznəmə yazığım gəldi və bu səbəbdən qoltuq cibimdən dəftərçəni çıxartdım və uzatdım yeznəmə tərəf.* C.Məmmədquluzadə.

2. Kürəkən. *Ay yeznə, ürək yeznə; Enlicə kürək yeznə: Oğlu, qızı içində; Evində gərək yeznə.* (Bayatı).

**YEZUİT** [*lat.* Yesus] 1. Katolik dininin ən mürtəce və qəddar təşkilatlarından biri olan "İsa cəmiyyəti" adlı cəmiyyət üzvü.

2. *məc.* Hər cür xəyanət və rəzalətə hazır olan çox məkrli, ikiüzlü adam haqqında.

**YEZUİTLİK** *is.* İkiüzlülük, riyakarlıq, öz məqsədinə çatmaq üçün heç bir vasitədən çəkinməmə.

**YƏD** *is.* [*ər.*] *klas.* Əl. ◻ **Yədi-beyza** – əsatirə görə Musa peyğəmbərin möcüzə göstərən əlinə işarə olan bu ifadə klassik ədəbiyyatda və folklorda fövqəladə məharət, bacarıq, hünər, qabiliyyət mənasında işlənmişdir. *Dəsturovun ərizə yazmaqda yədi-beyzası vardı.* Ə.Haqverdiyev.

**YƏĞMA** *is.* [*fars.*] *klas.* Özgənin malını zorla əlindən alma; çapovul, qarət, soyğun(çuluq). *Verir yəğmayə nəqdi-gəncin olcaq pasiban sərxoş.* Füzuli. *Qoşun qaçdı, boşaldı meydani-cəng; Bütün getdi yəğmayə tupü tüfəng.* M.Ə.Sabir.

**YƏHƏR** *is.* 1. Üstündə oturmaq üçün qayışlarla atın belinə bağlanan oturacaq. [Doktor:] *Atı yəhərin altında yox, qoşquda görməyi daha da artıq xoşluyuram.* C.Məmmədquluzadə. // Velosiped oturacağı. ◻ **Yəhər qaşı** – yəhərin dal və qabaq tərəfindəki çıxıq hissə. *Abbas kişi dolu bir heybə hazırlayıb yəhərin qaşına saldı.* Mir Cəlal.

2. *k.t.* Calaq üsullarından biri. *Qələm calağı calaqaltının yoğunluğundan asılı olaraq yarma, yəhər və sadə üsullarla edilir.* İ.Axundov.

**YƏHƏRALTI** *is.* Yəhəri atın belinə bərkidən qayış.

**YƏHƏRBURUN** *sif.* Burnu yastı. *O yandan patron paylayan yəhərburun əsgərin səsi eşidildi.* Ə.Əbülhəsən.

**YƏHƏRÇƏ** *is.* Balaca yəhər.

**YƏHƏR-ƏSBAB** *top.* Yəhər və s. qoşqu ləvazimatı.

**YƏHƏRQAŞ** *sif.* Yəhərin qaşına bağlanan, yəhərin qaşından asılan. *O, yəhərqaş xurcununda həmişə neştər, biz gəzdirər, yeri gələndə işə salardı.* S.Rəhimov.

**YƏHƏRQAYIRAN** *is.* Yəhər qayıran usta; sərrac.

**YƏHƏRLƏMƏ** "Yəhərləmək"dən *f.is.*

**YƏHƏRLƏMƏK** *f.* 1. Atın belinə yəhər bağlamaq. *Rizvan öz atını* [müəllim] *üçün həyətdə yəhərləməklə məşğul idi.* S.Hüseyn. *Musa kişi birbaş tövləyə getdi. Boz atı yəhərlədi və həyətə çəkdi.* M.İbrahimov.

2. *məc. dan.* Özünə tabe etmək; cilovlamaq. *..Bəylər onu yəhərləyə bilmədilər, başladılar donosbazlığa, vəssalam!* N.Vəzirov.

**YƏHƏRLƏNMƏ** "Yəhərlənmək"dən *f.is.*

**YƏHƏRLƏNMƏK** *məch.* Belinə yəhər qoyulmaq. *At yəhərləndi.*

**YƏHƏRLƏTMƏ** "Yəhərlətmək"dən *f.is.*

**YƏHƏRLƏTMƏK** *icb.* Başqası vasitəsilə yəhər qoydurmaq. *Atları yəhərlətmək.*

**YƏHƏRLİ** *sif.* Belinə yəhər qoyulmuş, belində yəhər olan. *Düzlərdə, tarlalarda əkinçilik işi ilə məşğul olan hər bir kəndlinin atı da yəhərli* (z.) *bir halda tarlanın kənarındakı ağaca bağlanıb durmuşdur.* M.S.Ordubadi. *Atları yəhərli buraxır ota; Kimisi otura, kimisi yata; Tuturlar Osmanın ölüm yasını.* H.K.Sanılı.

**YƏHƏRVURMA** *is.* Atların və b. heyvanların belində yəhərin sürtüb əmələ gətirdiyi yara.

**YƏHƏRYANI** *sif.* Yəhərin yanında olan. *Yəhəryanı qayış.*

**YƏHUDİ** [*ər.*] 1. *is.* Eramızın I–II əsrlərindən qabaq Fələstində yaşamış, sonradan dünyanın müxtəlif ölkələrinə yayılmış, indi isə İzrail dövlətinin əsas əhalisini təşkil edən xalq və həmin xalqa mənsub adam; cuhud. *Yəhudi xalqı. – Yalnız yəhudi qızı Rima hələ ərə getməmişdi.* M.Hüseyn.

2. *Sif. mənasında*. Yəhudi xalqı. *Yəhudi dili. Yəhudi ədəbiyyatı. Süleyman qədim yəhudi dini tarixində peyğəmbər və qüdrətli hökmdar kimi göstərilir. Bədii ədəbiyyatda qüdrətli hökmdar rəmzi kimi işlənir.*

**YƏHUDİCƏ** *zərf* və *sif.* Yəhudi dilində. *Yəhudicə qəzet. Yəhudicə oxuya bilir.*

**YƏHUDİLƏŞMƏ** "Yəhudiləşmək"dən *f.is.*

**YƏHUDİLƏŞMƏK** *f.* Yəhudi dinini və ya adət və xasiyyətlərini qəbul etmək, mənimsəmək.

**YƏHUDİLİK** *is.* Yəhudi dini. // Bu dinə mənsubiyyət.

**YƏHUDİPƏRƏST** *sif.* və *is.* [*ər.* yəhudi və *fars.* ...pərəst] Yəhudiləri, yəhudi adət və ənənələrini sevən adam.

**YƏHUDİPƏRƏSTLİK** *is.* Yəhudiləri, onların adət və ənənələrini sevmə.

**YƏQİN** 1. *zərf* Şəksiz, şübhəsiz, səhih, inamla. *Yəqin demək olar ki, ramazan ayı*

*müsəlmanlardan ötrü yemək ayıdır, qonaqlıq ayıdır, toy-bayram ayıdır.* C.Məmmədquluzadə. *Bəllidir yerimiz yəqin divana.* H.K.Sanılı. ☐ **Yəqin bilmək** – tamamilə düzgün olduğuna inanmaq, heç bir şübhə etməmək. *Məsələni yəqin bilmirəm. – Onu yəqin bil ki, mənim sözüm sözdür.* Ü.Hacıbəyov. **Yəqin etmək** – bir şeyin doğruluğuna tamamilə inanmaq, yəqinlik hasil etmək. *Mən bunların Hacı Mirzağa Billurinin əmri ilə gəldiklərini yəqin etdim*. M.Ordubadi. **Yəqin olmaq** – doğru olduğu aşkara çıxmaq, sübuta çıxmaq. *Məsələ yəqin oldu*. Ü.Hacıbəyov. // Xəbər şəkilçisi ilə **yəqindir** – şübhəsizdir, şübhə yoxdur. *Bu hüsnü lətafətdə yəqindir bəşər olmaz*. S.Ə.Şirvani.

2. *is.* Həqiqət; əsil, həqiqi vəziyyət, hal və s. *Yəqinini bilmirəm. Yəqin budur ki, ... Yəqininə gəldikdə...*

3. *ara s.* Ehtimal, ola bilsin, görünür (bu mənada çox vaxt "ki" bağlayıcısı ilə). *Əhvalatı, yəqin, sən də eşitmisən. Yəqin, kino da olacaq. Yəqin, xəstədir. Yəqin, gələcək. Yəqin ki, cavanlığını xatırlayır. – Yəqin ki, Sultan bəyin qızıdır, amma əcəb gözəl qızdır, bərəkallah, Əsgərə!* Ü.Hacıbəyov. *Yəqin ki, məni də müzakirəyə çağıracaqlar*. M.Hüseyn. [Qadın] *yəqin, bu sakit guşədə kənar bir göz olmadığına şübhə eləmirdi..* İ.Hüseynov.

**YƏQİNCƏ** *zərf* Yəqin, düz, doğru, inanaraq. "*Molla Nəsrəddin*" *məzəlilikcə söylədiyi sözlər və istehzalar, yəqincə yazdığı xəbərlər eyni ilə nəticə verdi*. F.Köçərli.

**YƏQİNƏN** *köhn.* Şəksiz, şübhəsiz; əsla şəkk və şübhə olmadan. *Hər kim ki, getməyibdi, yəqinən gedən bilər; Guya ki, bir behiştdi yaylağı Gəncənin.* Aşıq Abbas.

**YƏQİNLƏŞDİRMƏ** "Yəqinləşdirmək"dən *f.is.*

**YƏQİNLƏŞDİRMƏK** *f.* Yəqin etmək, həqiqət olduğunu müəyyən etmək.

**YƏQİNLƏŞMƏ** "Yəqinləşmək"dən *f.is.*

**YƏQİNLƏŞMƏK** *f.* Yəqin olmaq, həqiqət olduğu müəyyənləşmək.

**YƏQİNLİK** *is.* Şəkk və şübhəsizlik, düzlük, doğruluq, həqiqilik. *Bu ehtimalı xatirə gətirə bildiyinə xoşlanan Nəriman bu hadisənin yəqinliyini düşünəndə məyus oldu.* Mir Cəlal. ☐ **Yəqinlik hasil etmək** – bir şeyin doğru olduğunu müxtəlif yollarla müəyyən etmək, yəqin etmək, inanmaq. **Yəqinlik hasil olmaq** – doğru olduğu müəyyənləşmək, aşkara çıxmaq. *Bu xüsusda hamıda yəqinlik hasil oldu*. – [Soltan bəy:] *Bəs elə isə, bir balaca üzünü göstər ki, yəqinlik hasil olsun*. Ü.Hacıbəyov.

**YƏMİN** *is.* [*ər.*] And, qəsəm. ☐ **Yəmin etmək** – and içmək. *Bu şanlı bayrağı al, ona yəmin et.* S.S.Axundov. *Qurana yəmin etdim isə, sonra unutdum; Əhrarı, fədailəri birdən topa tutdum..* A.Səhhət.

**YƏMİNLİ** *sif.* Andlı, and içmiş.

**YƏNİ** *bağl.* Özündən əvvəlki fikri izah edən cümlələri və ya cümlə üzvlərini birləşdirmək üçün işlənir. *Biz üç nəfər, yəni mən və iki yoldaşım irəlidə gedirdik. Deyə bilməyəcəyəm, yəni deməyə ixtiyarım yoxdur. – Mən özüm anadan olmuşam düz otuz il bundan irəli, yəni mənim düz otuz yaşım var.* C.Məmmədquluzadə. [Sənəm:] *Yəni batmış bu qədər çirkindir ki, adam qorxa da bilər?* Ü.Hacıbəyov. ☐ **Yəni ki** – yəni, lakin (bir qədər kinayə, şübhə ifadə edir). *Yəni ki, o bilir, biz heç şey bilmirik.*

**YƏS** *is.* [*ər.*] Yas, hüzn. *Başını qaldırıb Maral xəritə üzərində yarımsantimetrlik bir sahə tutan bu yerə baxdı və yəslə* (z.) *öz-özünə pıçıldadı.* Ə.Əbülhəsən.

**YƏSAVƏR** *sif.* [*ər.* və *fars.*] Ümidsizlik, məyusluq gətirən, matəm törədən.

**YƏŞƏM** *is.* [*ər.*] *miner.* Xırda kvars dənəciklərindən ibarət qırmızı, yaşıl və s. rəngli süxur, daş (bəzək şeyləri qayrılır).

**YƏZDAN** *is.* [*fars.*] 1. *mif.* Qədim zərdüştilərdə xeyir allahı.

2. Yaradan, Allah, Tanrı.

**YƏZİDİ** *is.* [*ər.*] Yaxın Şərqdə əsasən kürdlər arasında yayılmış bir məzhəb (yəzidilər dünyanın yaradılmasında iblisi Allaha şərik tutur və getdikcə iblisin qüdrətinin üstün olacağı əqidəsindədirlər). // Bu məzhəbə mənsub adam. *Yəzidi qəbilələri.*

**YƏZİDİLİK** *is.* Yəzidi məzhəbi və ona mənsubiyyət.

**YIĞCAM** *sif.* 1. Dağınıq olmayan; qısaca, müxtəsərcə, qısa, toplu. *Yığcam ifadə. Fikrini yığcam* (z.) *şəkildə anlatmaq*.

2. Kiçik, lakin səliqəli, hər şey öz yerində; rahat. *Bu, tək pəncərəli, taxçalı, buxarılı, keçə ilə döşənmiş yığcam bir otaqdı.* Ə.Əbülhəsən.

**YIĞCAMLIQ** *is.* Yığcam şeyin halı.

**YIĞDIRMA** "Yığdırmaq"dan *f.is.*

**YIĞDIRMAQ** *icb.* Başqasına yığma işi gördürmək. *Taxılı yığdırmaq. Məhsulu yığdırmaq. – Qulam müəllim şeyləri daşıtdırıb bir tərəfə yığdırdı.* S.Rəhimov.

**YIĞICI** *is.* 1. Yetişmiş məhsulu yığmaqla məşğul olan adam. *Yığıcı briqadası. – Yığıcılar üçün döşlük hazırlanmış, qapanların hamısı təmir edilib yoxlamadan keçirilmişdir.* Ə.Vəliyev.

2. Pul, şey yığıb saxlamağı sevən adam, yığımcıl adam. // Ümumiyyətlə, bir şeyi yığıb toplamaqla məşğul olan adam; kolleksiyaçı. *Marka yığıcısı. Qədim kitablar yığıcısı. Folklor yığıcısı.*

**YIĞILAN** *f.sif.* Yuyulmaq, islanmaq və s. nəticəsində qısalan, gödələn, əvvəlki ölçüsü azalan. *Yığılan parça. Aşısız gön yığılan olur.*

**YIĞILI** *sif.* Yığılmış halda olan, toplanmış halda olan. *Yığılı yük. Yığılı pul. Şeylər yığılı* (z.) *halda həyətdə durur.*

**YIĞILIŞ** *is.* Yığılma, toplanma işi və tərzi; yığılma, toplanma, cəmləşmə.

**YIĞILIŞMA** "Yığılışmaq"dan *f.is.*

**YIĞILIŞMAQ** b a x **yığışmaq**.

**YIĞILMA** "Yığılmaq"dan *f.is. Taxılın yığılmasına az qalıb.*

**YIĞILMAQ** 1. *f.* Bir yerə toplaşmaq, cəm olmaq; cəmləşmək. *İştirakçıların hamısı yığılmayıb. Mitinqə çoxlu adam yığılıb. Camaat yığılıb sizi gözləyir. – Hamı dükanlarını bağlayıb buraya yığılır.* Ü.Hacıbəyov. *Şabanın getməyini eşidib, sair bikar tamaşaçılar da kənardan yığılmışdılar.* Ə.Haqverdiyev.

2. *t-siz.* Yuyulmaq, islanmaq və s. nəticəsində qısalmaq, gödəlmək, əvvəlki ölçüsünü itirmək. *Köynək yuyulandan sonra xeyli yığılıbdır.*

3. *məch.* Toplanılmaq, dərilmək. *Məhsul yığıldı. Pambıq yığılmağa başlanıbdır. – Oktyabr ayının ortaları idi. Kənddə üzüm qızğın yığılırdı.* Ə.Vəliyev. *Şah yedi, doydu, süfrə yığıldı.* M.F.Axundzadə.

4. *məch.* Yığışdırılmaq, ortadan götürülmək; bitmək, qurtarmaq. *Ağarmışdı başı uca dağların; Yığılmış dəsgahı güllü bağların.* H.K.Sanılı.

**YIĞIM** *is.* 1. Toplama işi. *Vəsait yığımı. Yığım mənbələri.* // Məhsulu yığma, əkini biçmə, meyvəni dərmə. *Taxıl yığımı. Dərman otları yığımı. Çay yarpağı yığımı. – Çox çəkmədi ki, qızlar pambıq yığımına başladılar.* Ə.Vəliyev.

2. Yığılmış, toplanmış məhsul və s. yığılmış, toplanmış məhsulun və s.-nin ümumi miqdarı. *Taxılın ümumi yığımı. Bu il pambıq yığımı keçən ilkindən xeyli çox oldu.* // Bir şey üçün alınan və ya toplanan pul; gəlir. *Sığorta yığımı. Gömrük yığımı. Xalis yığım.*

3. Bir yerə yığılmış şeylərin məcmusu; yığın.

**YIĞIMCIL** *sif.* Ehtiyat yığan, ehtiyat yığmağı sevən. *Yığımcıl adam.* – [Mürsəl:] [Anam] *çox yığımcıl qadındır.* Mir Cəlal.

**YIĞIMCILLIQ** *is.* Yığımcıl adamın xasiyyəti, ehtiyat yığmağı sevmə.

**YIĞIN** *is.* 1. Koma, qalaq, topa; yığıntı halında olan şey. *Ot yığını. Saman yığını. Şey yığını. Odun yığını. – Sarxan özü sağ tərəfdəki torpaq yığınının arxasında uzandı.* M.Hüseyn.

2. B a x **yığım**.

3. Kütlə, izdiham, qələbəlik, bir yerə toplanıb yığılmış camaat.

◊ **Bir yığın** – çox miqdarda, çoxlu. *Bir yığın kitab. Bir yığın adam. – Çalışdılar bu bir yığın insanlar; Xırmanlarda, tarlalarda, biçində.* A.Səhhət. *Səhərdir. Məktəbə yollanır Xumar; Yanında bir yığın yoldaşı da var.* S.Vurğun.

**YIĞINACAQ** b a x **yığnaq**.

**YIĞINCAQ** *is.* 1. Hər hansı bir məsələni və ya məsələləri müzakirə etmək üçün çağırılan ümumi iclas. *Yığıncaqda iştirak etmək. Yığıncaq keçirmək. Yığıncaqda çıxış etmək.* – [Mirzağa] *çox vaxt ümumi iclaslara, işçi yığıncaqlarına getməzdi.* S.Hüseyn. // Həmin iclasın iştirakçıları. *Yığıncaq qərar çıxartdı. Yığıncaq təklifi bir səslə qəbul etdi.*

2. İzdiham, qələbəlik, camaat. *Bir gün nəzmiyyə qabağından keçirdim, gördüm orada bazar əhlindən bir böyük yığıncaq var.* C.Məmmədquluzadə.

3. Məclis, qonaqlıq. [Şərəfnisə xanım:] *Müsyö Jordan beyninə salıbdır ki, Parijdə qızlar, gəlinlər məclisdə, yığıncaqda üzüaçıq oturub-dururlar.* M.F.Axundzadə.

**YIĞINTI** *is.* 1. Qalıqlardan, tullantılardan, tör-töküntüdən və s.-dən yığılmış qalaq. *Dəmir tullantı yığıntısı. Zibil yığıntısı. – Əjdər bir az da uzaqlaşmalı, kənardan, daş və qum*

*yığıntılarının arası ilə getməli oldu.* S.Rəhman.

2. Çay və yağış suları ilə gəlib çökən dağ süxurları qırıntıları (daş, qum, lil və s.). *Şiddətli yağmurun yığıntısını toplayan və azğın seli gətirən qorxunc dərələrin üstündən körpülər salınırdı.* S.Rəhimov.

3. *Sif. mənasında.* Müxtəlif yerlərdən toplanma, müxtəlif yerlərdən gəlib cəmləşmiş, camaatı müxtəlif yerlərdən gəlmə adamlardan ibarət olan. *Yığıntı məhəllə. Yığıntı kənd.*

**YIĞIN-YIĞIN** *sif.* Topa-topa, dəstə-dəstə; qələbəlik, izdiham halında. *Yığın-yığın insan kütləsi.* // Qalaq-qalaq. *Yığın-yığın odun.*

**YIĞIŞ** *is.* Yığma işi, yığma tərzi.

**YIĞIŞAN** b a x **yığılan**.

**YIĞIŞDIRILMA** "Yığışdırılmaq"dan *f.is.*

**YIĞIŞDIRILMAQ** "Yığışdırmaq"dan *məch. Çay içilib qurtardı, süfrə yığışdırıldı.* M.S.Ordubadi.

**YIĞIŞDIRMA** "Yığışdırmaq"dan *f.is.*

**YIĞIŞDIRMAQ** *f.* 1. Tökülmüş, səpələnmiş, salınmış, düzülmüş, qoyulmuş şeyləri yığıb götürmək. *Stolun üstünü yığışdırmaq. Şeyləri yerdən yığışdırmaq. – Kərbəlayı Cəfər süfrəni, qabları yığışdırıb qoydu kənara.* C.Məmmədquluzadə. *Səfərlə Tanrıverdi Qurbanın paltarını yığışdırıb götürərkən arasından yerə bir məktub düşdü.* A.Şaiq. // Səliqəyə, sahmana, qaydaya salmaq, düzəltmək, təmizləmək, sil-süpür etmək. *Otağı yığışdırmaq. – Telli inəkləri töyləyə saldıqdan sonra, Gülpərinin buraxıb getdiyi evi yığışdırdı.* S.Hüseyn.

2. Çəkmək, dartıb bir yerə yığmaq. *Ətəklərini yığışdırmaq.*

◊ **Əl-ayağını yığışdırmaq** – b a x **əl-ayaq**. **Özünü yığışdırmaq** – b a x **öz**.

**YIĞIŞMA** "Yığışmaq"dan *f.is.*

**YIĞIŞMAQ** *f.* 1. Bir yerə toplanmaq, yığılmaq, cəmləşmək, toplaşmaq. *Əhali meydana yığışdı. –* [Qız evində] *parça biçməyə hər iki quda ailə öz möhtərəm arvad qohumlarını dəvət edib yığışarlar.* R.Əfəndiyev. *Bütün Təbriz* [nümayişçilərin] *tamaşalarına yığışmışdı.* M.S.Ordubadi.

2. Bir yerə getmək, yola çıxmaq üçün hazırlıq görmək, şeylərini qablaşdırıb hazır olmaq. *Yığışın, sabah gedirik.* // Hazırlaşmaq. [Pəri xanım:] *Ay Sona! Neçə vaxtdır ha yığışıram, bircə səni görməyə gəlim.* Ə.Haqverdiyev. // Bir yerdən başqa yerə köçüb getmək. [Hacı Sultan] *artıq Şamaxı yolunda qalmaq istəmədi. Oradan yığışıb dəniz qırağında ticarət kontoru açdı.* S.Hüseyn.

3. Büzüşmək, bürüşmək. *Yarməmmədin üzgözü yığışdı, turşudu, tez cibindən əzik-üzük və çirkli ağ yaylığı çıxarıb ovcunda sıxdı və üzünə tutub asqırdı.* M.İbrahimov. // B a x **yığılmaq** 2-ci mənada.

**YIĞMA** "Yığmaq"dan *f.is.*

◊ **Yığma qoymaq** – şərikli pul qoymaq, şərik olmaq, pay qoymaq. *Şamaxı cavanları yığma qoyub, məndən savay da iki dəstə çalğıçı götürüb yaylağa səyahətə getmişdilər.* Ə.Haqverdiyev. **Yığma komanda** – müxtəlif komandalardan seçilib yığılan idmançılardan düzəldilən komanda.

**YIĞMAQ** *f.* 1. Bir yerə toplamaq, cəm etmək. *Adamları bir yerə yığmaq. İşçiləri yığıb söhbət aparmaq. – Aslan paşa car çəkdirib bütün camaatı meydana yığmışdı.* "Koroğlu". // Müxtəlif şəxslərdən almaq, toplamaq. *Üzvlük haqqı yığmaq. Vergi yığmaq. Məlumat yığmaq. Divar qəzeti üçün məqalə yığmaq. – Qazı cənabları məktəb açmaq üçün bir gündə əlli çuval buğda "zəkat" yığdı.* C.Məmmədquluzadə. *Qaraçı qavalını açıb, pul yığır.* Ü.Hacıbəyov. *Fikirləşdim ki, bəlkə adama bir az pul yığıb verək.* M.Hüseyn. // Qənaət edərək, dala ataraq yavaş-yavaş toplamaq, ehtiyat görmək. *Ehtiyat yığmaq. Pul yığmaq.*

2. Yetişmiş məhsulu, meyvəni toplamaq. *Taxılı yığmaq. Pambığı yığıb qurtarmaq. Bağın məhsulunu yığmaq.* // Bir şey toplamaqla, dərməklə məşğul olmaq. *Çiyələk yığmaq. Başaq yığmaq. Dərman otları yığmaq. – Atası Mahmudalı kişi sədrlik eləyəndə, Şamama: – Atama kömək edirəm, – deyə həvəslə pambıq yığırdı.* Ə.Əbülhəsən.

3. Yığışdırmaq, götürmək. *Yorğan-döşəyi yığmaq. Xalçaları yığıb naftalinləmək. – Arvad ikinci gün nahar vaxtı stolun üstündən yanları göy haşiyəli kətan örtüyü yığmaq istəmişdi.* Ə.Sadıq.

4. Qalaq-qalaq, topa-topa düzmək, qoymaq. *Taya yığmaq. Odunu anbara yığmaq. Kitabları şkafa yığmaq. Şeyləri bir yeşiyə yığmaq.* // Ümumiyyətlə, qoymaq, düzəltmək.

*Gülərlə Yaşar böyük tasın içində göyərti yuyub boşqablara yığırdılar.* M.İbrahimov.

5. Quraşdırmaq, ayrı-ayrı hissələrini birləşdirib tam şəklə salmaq. *Mexanizmi söküb yığmaq.*

6. Yavaş-yavaş, hissə-hissə toplamaq, kolleksiya düzəltmək. *Marka yığmaq. Nadir şeylər yığmaq. Qədim kitablar yığmaq.*

**YIĞNAQ** *is.* 1. Yığıncaq; yığılmış, toplanmış adamlar və s.; qələbəlik, tünlük. *Bu nə yığnaqdır? – Yaşardı orada qaçaq yığnağı; Olardı dövlətə açıq bir yağı..* H.K.Sanılı. ☐ **Yığnaq eləmək (etmək)** – yığılıb danışmaq, məsləhətləşmək. *Çağır Kükümlə Muxtarı; Otağa, yığnaq eləyək!* Aşıq Ələsgər. **Yığnaq salmaq** *kin.* – toplaşmaq, yığışmaq. *Gündə bir qapıya salırlar yığnaq.* Q.Zakir. // Bir yerə yığılmış, toplanmış şeylər. *Keçibdir beş yüzü dərədə yığnaq; Toplanmış imperyal bir dolu çanaq.* H.K.Sanılı.

2. Qonaqlıq, məclis. *Xeyrin olsun, hər kəs yığnağındadır; Onlar ilə zövqü işrət eylərsən.* M.V.Vidadi. [Divanbəyi:] *Xub, o şeytan yığnağına rast gələn uşaqları mənə göstərin.* M.F.Axundzadə. *Düşəndə məclisə, ağır yığnağa; Mənə hörmət qoyur irəncbər, ağa.* Aşıq Ələsgər.

**YIXDIRILMA** "Yıxdırılmaq"dan *f.is.*

**YIXDIRILMAQ** "Yıxdırmaq"dan *məch.*

**YIXDIRMA** "Yıxdırmaq"dan *f.is.*

**YIXDIRMAQ** "Yıxmaq"dan *icb.* [Pristav oğruya:] *Doğrusunu de, yoxsa səni yıxdırıb, o qədər döydürərəm ki, bir ay yorğan-döşəkdə qalarsan.* Ə.Haqverdiyev.

**YIXICI** *sif.* Yıxan, dağıdan; viranedici, dağıdıcı, sarsıdıcı.

**YIXICILIQ** *is.* Dağıdıcılıq, sarsıdıcılıq, yıxıb-dağıtma, viran etmə.

**YIXIQ** *sif.* Yıxılmış, uçulmuş, dağılmış, uçuq. *Yıxıq ev. Yıxıq divar. Yıxıq dam. – Dünyada özündən başqa əzəmətli bir şəxs görməyən Dara bu yıxıq sovmədə keçi dərisinə bürünmüş qocaya baxaraq .. soruşur.* Çəmənzəminli.

**YIXIQLIQ** *is.* Yıxıq, uçuq şeyin hal və vəziyyəti.

**YIXILA-DURA** *zərf* Gah yıxılaraq, gah duraraq; çox çətinliklə. *Yıxıla-dura özümü evə çatdırdım. – Bu ümidlə də* [Səriyyə xala] *yıxıla-dura, taqətdən düşmüş dizlərini bükə-bükə qüvvələrini gərginləşdirər və yeriyirdi.* M.İbrahimov.

**YIXILQAN** *sif.* Çox yıxılan, ayağı büdrəyən; büdrək. *Yıxılqan at.*

**YIXILI** *sif.* Yıxıq, yıxılmış.

**YIXILMIŞ** *is.* Yıxılmaq işi; yıxılma, uçulma.

**YIXILMA** "Yıxılmaq"dan *f.is.*

**YIXILMAQ** *f.* 1. Öz ağırlığı ilə yerə enmək, müvazinətini, yaxud istinad nöqtəsini itirərək aşağıya devrilmək, yerə dəymək. *Başı gicəllənib yıxıldı. Pilləkəndən yıxılmaq. – Məşədi, tərpənsən, yıxılarsan ki...* Ü.Hacıbəyov. *Gərək yadındadır... üç il qabaq mən; Qayadan dənizə yıxıldım birdən.* S.Vurğun. // Kökündən qopub yerə sərilmək. *Küləyin şiddətindən çoxlu ağac yıxılıbdır.* // Köhnəlikdən uçmaq, dağılmaq, yerə tökülmək. *Evin divarları yıxıldı. Hasar yıxıldı.*

2. Yerə uzanmaq, yerə sərilmək. *Onda görürsən yıxılıb yanbayan; Bir neçə növrəstə cavan laybalay.* M.Ə.Sabir. ☐ **Yıxılıb-yatmaq** – yatmaq, yatmaq üçün yataqda uzanmaq. *Xudayar katda ləzzətnən yıxılıb-yatdı.* C.Məmmədquluzadə. *İki seyid əmmaməni bir tərəfə atıb bir qədər oynadılar, axırda yıxılıb-yatdılar.* Ə.Haqverdiyev.

3. *məc.* Hakimiyyətdən salınmaq, devrilmək, düşürülmək, düşmək. *1917-ci ilin fevralında çar mütləqiyyəti yıxıldı.* – [Qatır Məmməd:] *Padşah yıxıldı, gorbagor oldu; Uçdu sarayları, tar-mar oldu.* Z.Xəlil. // Əmr formasında: **yıxılsın!** – məhv olsun! yox olsun! dağılsın! viran qalsın! *Yıxılsın məğrur saray! Buludlara batsın Ay.* S.Vurğun.

**yıxıla-yıxıla** *zərf* Gah yıxılaraq, gah duraraq; çox çətinliklə. *Yıxıla-yıxıla getmək. – Zavallı, bəxtsiz bacı evdə qardaşının müsibətində qızğın göz yaşları tökdüyü bir zamanda, ana yıxıla-yıxıla dışarı çıxıb oğlunu yerə sərilmiş .. görərsə, nə yapa bilər?* S.Hüseyn. *..Tapdıq bu cəhrənin qabağında yata-yata, otura-otura, yıxıla-yıxıla böyümüşdü.* Ə.Əbülhəsən.

**YIXILMAZ** *sif.* Yıxılması, dağılması mümkün olmayan; sarsılmaz, devrilməz. *İpəkdir vicdanın, poladdır yaxan; Yıxılmaz dağlara dayanmış arxan.* S.Vurğun. // Yenilməz, məğlubedilməz, alınmaz, möhkəm. *Yıxılmaz qala.*

**YIXILMAZLIQ** *is.* Yıxılmaz şeyin hal və keyfiyyəti; sarsılmazlıq, dağılmazlıq, möh-

kəmlik. // Yenilməzlik, alınmazlıq, məğlubedilməzlik, möhkəmlik.

**YIXILMIŞ** "Yıxılmaq"dan *f.sif.* *Yıxılmış uşaq. Yıxılmış bina. Yıxılmış divar.*

**YIXMA** "Yıxmaq"dan *f.is.*

**YIXMAQ** *f.* 1. İtələyib, vurub, yaxud bərk toxunub yerə salmaq, yerə düşürtmək, yerə vurmaq; aşırmaq. *Öküzü nallamaq üçün yerə yıxdılar. Külək adamı yıxır.* // Üzərindən atmaq, yerə salmaq, devirmək, yerə vurmaq. *Uşağı at yıxdı.*

2. Yanı üstə qoymaq.

3. Bütün ağırlığı ilə düşmək, salmaq. [Kiçikxanım] *güclə özünü taxtın üstünə yıxdı.* Mir Cəlal.

4. Uçurmaq, dağıtmaq, xaraba qoymaq, viran etmək. *Divarı yıxmaq. – Yıxar qayaları, atar dağları; Kəməndinə salar Koroğlu səni.* "Koroğlu". *Böyük bir dünyanı yıxmaq, uçurmaq; Yerində başqa bir dünya da qurmaq?* S.Vurğun.

5. Güləşmədə: basmaq, məğlub etmək. [Xəlfə:] *..Süleymanı bu vaxtadək yıxan olmamışdı, elə verdin xoruzunu qoltuğuna!..* C.Cabbarlı.

6. *məc.* Devirmək, zorla hakimiyyəti əlindən almaq. *İstismarçı sinifləri yıxmaq.* // *məc.* Mövqeyindən, vəzifəsindən düşürmək; mövqeyindən, vəzifəsindən düşməsinə nail olmaq.

7. Atmaq, həvalə etmək, yükləmək (adətən tərkiblərdə). *Üzərinə yıxmaq. Üstünə yıxmaq. Öhdəsinə yıxmaq. – Deməli, biz ərin günahını arvadın boynuna yıxmaqda haqlı deyilik?* M.Hüseyn.

**YIPRAMA** "Yıpramaq"dan *f.is.*

**YIPRAMAQ** b a x **yıpranmaq**.

**YIPRANMA** "Yıpranmaq"dan *f.is.*

**YIPRANMAQ** *f.* Tamamilə köhnəlib xarab olmaq, əldən düşmək, düşkün hala gəlmək. *Üst-başı yıpranmaq. Kitabın cildi tamamilə yıpranmışdır.* // Qocalıb əldən düşmək.

**YIPRANMIŞ** *f.sif.* Tamamilə köhnəlib xarab olmuş, üzülmüş, əldən düşmüş. *Yıpranmış paltar. Kitabın yıpranmış səhifələri. – Mənim bu sözüm bugünkü ictimai həyatımızın yıpranmış və solmuş səhifələrindən götürülmüş və onun xəstə cəhətlərini əks etdirən bir vəsiqədir.* Qantəmir. // Düşkün, üzgün, əldən düşmüş. [Kor kişinin] *yıpranmış vücudu, bozarmış saç-saqqalı yaşının əllidən artıqlığını, köhnə bir adam olduğunu bildirirdi.* S.Hüseyn.

**YIRĞALAMA** "Yırğalamaq"dan *f.is.*

**YIRĞALAMAQ** *f.* 1. O yan-bu yana, aşağıya və ya yuxarıya itələyərək hərəkət etdirmək; tərpətmək, silkələmək. *Külək ağacları yırğalayıb əyir. Araba yaman yırğalayır. – Həmişə sən mürgüləyirsən, nənə, yırğalayırsan başını.* C.Məmmədquluzadə. *O gözəl xilqətin nəydi vərdişi? Beşik yırğalayıb paltar yamamaq.* S.Vurğun.

2. Tərpətmək, yellətmək. *Uşağı yırğalamaq.*

**YIRĞALANDIRMA** "Yırğalandırmaq"dan *f.is.*

**YIRĞALANDIRMAQ** b a x **yırğalatmaq**.

**YIRĞALANMA** "Yırğalanmaq"dan *f.is.*

**YIRĞALANMAQ** *f.* O tərəf-bu tərəfə əyilərək hərəkət etmək; tərpənmək, silkələnmək. *Küləkdən ağaclar yırğalanır. Gəmi suda yırğalanır. – O biri otaqda yırğalanmaqda olan bir körpə beşiyinin həzin səsi eşidilirdi.* S.Hüseyn. *Görünməz olmuşdur dənizin dibi; Qayıq yırğalanır bir beşik kimi.* S.Vurğun.

**yırğalana-yırğalana** *zərf* Yırğalanaraq, ayaq üstə dura bilməyərək, o yan-bu yana əyilərək. *Yırğalana-yırğalana yerimək. – Yusif sərxoş halda, o tərəf-bu tərəfə yırğalana-yırğalana gəlib çıxdı.* S.S.Axundov.

**YIRĞALAŞMA** "Yırğalaşmaq"dan *f.is.*

**YIRĞALAŞMAQ** *qarş. dan.* Yırğalanmaq (çoxları haqqında). *Gəmidəkilər yırğalaşırlar.*

**YIRĞALATMA** "Yırğalatmaq"dan *f.is.*

**YIRĞALATMAQ** *f.* Yırğalanmağa məcbur etmək, yırğalanmasına səbəb olmaq. *Ləpə gəmini yırğaladır.*

**YIRĞANMA** "Yırğanmaq"dan *f.is.*

**YIRĞANMAQ** b a x **yırğalanmaq**.

**YIRTDIRMA** "Yırtdırmaq"dan *f.is.*

**YIRTDIRMAQ** *icb.* Yırtmasına, yırtılmasına səbəb olmaq.

**YIRTICI** *sif.* 1. Başqa heyvanların ətini yeyən. *Yırtıcı heyvanlar. Yırtıcı canavar. Qartal yırtıcı quşdur. – Başqa balıqları tutub yeyən yırtıcı balıqlar olduğu kimi, "dinc" balıqlar da vardır.* "Zoologiya".

2. *məc.* Vəhşi, qəddar, qaniçən. *Yırtıcı faşist cəlladları. – Zaman çapır öz atını; Od parlayır süngülərdən; Rəzil düşmən yaralanmış; Yırtıcı bir canavardır.* S.Vurğun.

**YIRTICICASINA** *zərf* Yırtıcı kimi, vəhşi kimi; vəhşicəsinə, qəddarcasına. *Yırtıcıcasına hərəkət etmək.*

**YIRTICILAŞMA** "Yırtıcılaşmaq"dan *f.is.*

**YIRTICILAŞMAQ** *f.* Yırtıcı olmaq, vəhşiləşmək.

**YIRTICILIQ** *is.* 1. Yırtıcıların başqa heyvanları tutub yeməsi, yırtıcı xasiyyət. *Çöl-pişiklərinin yırtıcılığı.*

2. *məc.* Vəhşilik, qəddarlıq. *Yırtıcılıq etmək.*

**YIRTIQ**[1] *sif.* Cırığı, deşik yeri olan; yırtılmış. *Yırtıq corab. Yırtıq ayaqqabı. Yırtıq tutmaq* (*bir şeyin yırtığını tikmək, gözəmək*). – *Sikkə olmaz övladının cibində; Rizqləri yırtıq çuval dibində.* Q.Zakir. *Onlar bu gün köçüb düşmüşlər çah üstə; Yırtıq alaçıqda gecələyirlər.* A.Səhhət. // Köhnəlib dağılmış; üzülmüş, parça-parça, deşik-deşik olmuş. *Evdə dəst-dəst qəşəng paltarlarının olmasına baxmayaraq, özü çirkli, yırtıq və kirli paltar geyirdi.* Ə.Sadıq.

**YIRTIQ**[2] *is.* Hər hansı bir orqanın, adətən nazik bağırsağın dəri altına çıxmasından ibarət xəstəlik; dəbə.

**YIRTIQ-DEŞİK** *is.* Deşilmiş, yırtılmış yer. *Yırtıq-deşiyini tutmaq.*

**YIRTIQLIQ** *is.* Yırtıq şeyin halı. *Kisənin yırtıqlığı. Ayaqqabının yırtıqlığı.*

**YIRTIQ-YAMAQ** *is.* Köhnə, yırtıq şeyləri yamama işi və bu şeylərin özü. ☐ **Yırtıq-yamaq vurmaq** – yamamaq, təmir etmək. *Natalya əri üçün yırtıq-yamaq eləyib dəyişiyini torbaya yığmağa başladı.* H.Seyidbəyli.

**YIRTILMA** "Yırtılmaq"dan *f.is.*

**YIRTILMAQ** *f.* 1. Köhnələrək, yaxud sürtülərək, bir şeyə ilişərək deşilmək, yırtıq əmələ gəlmək; cırılmaq. *Ayaqqabısı yırtılmaq. Çuval yırtılmışdır.* // Köhnəlib dağılmaq. // *məch*. Cırılmaq. ..*Gərək hərəmxana xatunlarının da talağı verilib, kəbin kağızları yırtıla.* M.F.Axundzadə.

2. *məc*. Partlamaq. *Məndən bir gülməli söz eşidib .. az qaldı bağırsaqları yırtılsın...* C.Məmmədquluzadə.

**YIRTMA** "Yırtmaq"dan *f.is.*

**YIRTMAQ** *f.* 1. Geyib dağıtmaq, köhnəltmək, yırtıq hala salmaq. *Ayaqqabıları yırtmaq.* // İlişdirərək və ya başqa bir vasitə ilə qırmaq; qəlpələmək, deşmək. *Paltarını harada yırtmısan? – O olsun şikarın tutmağa məşğul; Mən olum torbanı yırtmağa məşğul.* Q.Zakir. // Cırmaq, ləğv etmək. *Talaq tamam olduqda şahın buyruğu ilə kəbin kağızlarını Xacə Mübarək yırtdı.* M.F.Axundzadə.

2. Parçalamaq, vəhşicəsinə dağıtmaq. *Bu yerə çün yetirdi qurd sözünü; Tutdu, yırtdı, dağıtdı ol quzunu.* A.Səhhət.

**YIR-YIĞIŞ** *is.* Yığışdırma işi; səliqəyə, sahmana salma işi. ☐ **Yır-yığış etmək (eləmək)** – yığışdırmaq, səliqəyə, sahmana salmaq. [Məşədi Səkinə xala] *onun evsizliyinə və şikəstliyinə yazığı gələr, hərdən evini yır-yığış edərdi.* Mir Cəlal.

**YİV** *is.* 1. Bir şeyin digərinə girib birləşməsi üçün açılan oyuq. *Çərçivə yivi. Pəncərə yivi.*

2. Eyni məqsəd üçün boru və s.-də açılan vintvari oyuq, cizgi. *Yiv açmaq. Yivi sürtülmək.* // Tüfənglərin, topların və s.-nin lüləsinin içində spiral şəklində qabarıq zolaq; xır.

**YİVAÇAN** *is.* Yiv açmağa məxsus alət.

**YİVLİ** *sif.* Yivi olan, yiv açılmış. *Yivli tüfəng* (*lüləsinin içində yiv olan tüfəng*).

**YİYƏ** *is.* Hər hansı bir şey üzərində mülkiyyət hüququ olan adam; sahib. *Oğul, Rövşən, get, buzov yiyəsinə pul ver, razı sal.* "Koroğlu". *Ev yiyəsi yaşlı bir arvad idi.* S.Hüseyn. ☐ **Yiyə çıxmaq** – sahibi özünü bildirmək, sahibi məlum olmaq, tapılmaq. **Yiyə durmaq** – sahib çıxmaq, yiyə kimi çıxış etmək, yiyə olduğunu bildirmək. *Dönsə, heç demirəm pis günlərimə; Yaxşı günlərimə yiyə durmaram.* M.Araz.

◊ **İt yiyəsini tanımır** – b a x **it**.

**YİYƏLƏNMƏ** "Yiyələnmək"dən *f.is.*

**YİYƏLƏNMƏK** *f.* 1. Zorla və qeyri-qanuni surətdə bir şeyə sahib olmaq. *Özgənin malına yiyələnmək. Kitabıma yiyələndi.*

2. *məc.* Yaxşı-yaxşı öyrənmək, bilmək, istifadə edə bilmək, bir şeyin ustası olmaq. *Biliklərə yiyələnmək.*

**YİYƏLİ** *sif.* Yiyəsi, sahibi olan.

**YİYƏLİK** *is.* Sahib olma, yiyə durma; sahiblik. ☐ **Yiyəlik etmək** – sahiblik etmək, bir sahib kimi idarə etmək, öz əlində saxlamaq. [Səttar bəy:] ..*Səlbnazın heç olmasa anası var, qovmusan, gedib evlərinə. Bunun heç kimi yoxdu, onunnan belə bir yerdə dilinə yiyəlik eləmir.* N.Vəzirov. // Hökmranlıq etmək.

◊ **Yiyəlik hal** *qram.* – ismin kimin? nəyin? və haranın? suallarına cavab olan halı.

**YİYƏSİZ** *sif.* Yiyəsi, sahibi olmayan; sahibsiz. *Yiyəsiz ev. Yiyəsiz mülk. Yiyəsiz bağ.* // Baxımsız. *Yiyəsiz uşaq.* // Zərf mənasında. *Yurd yiyəsiz qalanda donuz təpəyə çıxar.* (Ata. sözü).

**YİYƏSİZLİK** *is.* 1. Sahibi, yiyəsi olmama; sahibsizlik, baxımsızlıq.

2. *məc.* Tənhalıq, adamsızlıq. *Nə işıltı, nə də çıraq; Nə bir qara daxma var; Hər yer bütün yiyəsizlik; Hər yer bütün qalın qar.* A.Səhhət.

**YOD** [*yun.* iodes] Başlıca olaraq dəniz yosunlarından istehsal edilən tünd-boz rəngli, metal kimi parıldayan kristallik maddə (kimyəvi element). // Bu maddənin təbabətdə işlədilən spirtli məhlulu. *Yaraya yod sürtmək.*

**YODLAMA** "Yodlamaq"dan *f.is.*

**YODLAMAQ** *f.* Yod sürtmək, yod vurmaq. *Yaranı yodlamaq.*

**YODLU** *sif.* 1. Tərkibində yod olan. *Yodlu maddə. Yodlu dərman. Yodlu su.*

2. Yoda batmış, yod sürtülmüş.

**YODOFÓRM** [*yun.*] *əcz.* Təbabətdə antiseptik dərman kimi işlədilən kəskin qoxulu yod preparatı.

**YOĞRULMA** "Yoğrulmaq"dan *f.is.*

**YOĞRULMAQ** *məch.* 1. Təzyiq altında, yaxud əl və s. ilə ovuşdurularaq yayğın hala gətirilmək (xəmir və s.).

2. *məc.* Yaranmaq, əmələ gəlmək. *Şeir, sənət əzəl gündən sözün hüsnilə yoğrulmuş; Zamanın sirri, sevdası onun qəlbində nəqş olmuş.* S.Vurğun. // Qayrılmaq, yaradılmaq. [Rizvan:] *Və ya padşah bədəni qızıldan, bağban bədəni palçıqdanmı yoğrulubdur?* Ə.Haqverdiyev.

**YOĞRULMUŞ** "Yoğrulmaq"dan *f.sif. Yoğrulmuş xəmir.*

**YOĞUN** *sif.* 1. Həcmcə, en etibarilə böyük, geniş olan; qalın. *Yoğun ağac. Yoğun ip.* // Kök, dolğun, ətli-canlı. *Yoğun adam. – Bir kişi küçədə getdiyi yerdə görür ki, filan övrətin topuqları ağdır və yoğundur.* C.Məmmədquluzadə. *Qarnı yoğun, boynu da dam tiridir; Ruhu ölüb, nəfsi hələ diridir..* M.Ə.Sabir.

2. Qalın. *Yoğun səs.* [Cahandar ağanın] *yoğun, zəhmli səsi eşidildi.* İ.Şıxlı.

3. *məc.* Qaba, kobud, yontalanmamış, tərbiyəsiz; qanmaz, kütbeyin.

**YOĞUNBALDIR** *sif.* Baldırları yoğun olan.

**YOĞUNBOYUN** b a x **boynuyoğun**. *Hər bir şəhərimizdə ildə 10-15 imam ehsanı verən olur ki, yoğunboyun mollaları, şişpapaq tacirləri, .. qızıl təkbənd nücəbaları çaylayıb, plovlayıb yola salır..* N.Vəzirov.

**YOĞUNCA** *sif.* Çox yoğun. *Yoğunca bir adam olan Mehman dayı yerindən qalxıb kürsünün dalına gəldi.* Ə.Sadıq.

**YOĞUNDİMDİK** *sif.* Dimdiyi yoğun olan. *Yoğundimdik quş.*

**YOĞUNDODAQ** *sif.* Dodaqları yoğun olan. *Yoğundodaq adam.*

**YOĞUNQARIN** *sif.* Qarnı yoğun, yekə olan; qarnıyoğun, yekəqarın.

**YOĞUNQURŞAQ** *is. köhn. zar.* Keçmişdə mollalara, axundlara verilən istehzalı ad. *Elə iş baş verər yoğunqurşaqdan; Həq bilir ki, çıxmaz nadan uşaqdan.* Q.Zakir.

**YOĞUNLAMA** "Yoğunlamaq"dan *f.is.*

**YOĞUNLAMAQ** *f.* 1. Həcm etibarilə artıb böyümək, yoğun olmaq.

2. *məc. dan.* Ciddiləşmək, böyümək, ciddi şəkil almaq. – *Yox, Alo, – dedi, – doğrudur, sən mənim qeyrətimi buraxmazsan, amma iş yoğunlayıb.* S.Rəhimov. [Getdikcə] *söhbət yoğunlayırdı.* Ə.Əbülhəsən.

**YOĞUNLANMA** "Yoğunlanmaq"dan *f.is.*

**YOĞUNLANMAQ** *f.* 1. B a x **yoğunlamaq** 1-ci mənada.

2. Kobudlaşmaq.

**YOĞUNLAŞDIRILMA** "Yoğunlaşdırılmaq"dan *f.is.*

**YOĞUNLAŞDIRILMAQ** *məch.* 1. Daha yoğun (qalın) edilmək.

2. *məc. dan.* Ciddiləşdirilmək, böyüdülmək, şişirdilmək.

**YOĞUNLAŞDIRMA** "Yoğunlaşdırmaq"-dan *f.is.*

**YOĞUNLAŞDIRMAQ** *f.* 1. Daha yoğun etmək; yoğunlatmaq.

2. *məc. dan.* Daha da ciddiləşdirmək; böyütmək, şişirtmək. *Məsələni yoğunlaşdırmaq lazım deyil.*

**YOĞUNLAŞMA** "Yoğunlaşmaq"dan *f.is.*

**YOĞUNLAŞMAQ** *f.* 1. Daha da yoğun olmaq.

2. B a x **yoğunlamaq**.

**YOĞUNLUQ** *is.* 1. Yoğun şeyin hal və keyfiyyəti. *Ağacın yoğunluğu. İpin yoğunluğu.*
2. Köklük, ətlilik, canlılıq, şişmanlıq. *Qarnının yoğunluğu əyilməsinə mane olur.*
3. *məc. dan.* Qabalıq, tərbiyəsizlik, qanmazlıq, kütlük.

**YOĞURMA** "Yoğurmaq"dan *f.is.*

**YOĞURMAQ** *f.* Qatı bir maddəni əzib qarışdırmaqla yayğın hala salmaq. *Xəmir yoğurmaq. Palçıq yoğurmaq. – Nə yoğurdum, nə yapdım; Hazırca kökə tapdım.* (Ata. sözü). ☐ **Yoğurub-yapmaq** – xəmir yoğurub çörək bişirməyi bacarmaq. [Yasəmən] *kütdür, toxumaq, yamamaq, yoğurub-yapmaq bilmir.* Mir Cəlal.

**YOĞURT** *is.* Qatıq.

**YOĞURTAŞI** *is.* Qatıqaşı.

**YOĞURTDURMA** "Yoğurtdurmaq"dan *f.is.*

**YOĞURTDURMAQ** b a x **yoğurtmaq**.

**YOĞURTDURULMA** "Yoğurtdurulmaq"-dan *f.is.*

**YOĞURTDURULMAQ** "Yoğurtdurmaq"-dan *məch*.

**YOĞURTMA** "Yoğurtmaq"dan *f.is.*

**YOĞURTMAQ** *icb.* Başqasına yoğurma işi gördürmək. *Xəmir yoğurtmaq.*

**YOĞURUCU** *sif. xüs.* Yoğurmaq üçün olan, yoğuran. *Yoğurucu maşın.*

**YOX** *əd.* 1. *Xəbər mənasında.* Bir şeyin hazırda, yaxud ümumiyyətlə olmadığını bildirir (*var* ziddi). *Yeməyi bol, iştahası yox. – Var evi – kərəm evi; Yox evi – vərəm evi.* (Ata. sözü). *Yox vaizin sözünə sözüm kim, behişt var; Kuyin bir özgə, cənnəti-didarın özgədir.* Qövsi. // Həmin mənada adətən **yoxdur** şəklində işlənir. *Evdə heç kəs yoxdur. Zalda boş yer yoxdur. Bu barədə heç bir şübhə yoxdur.* – [Əsgər:] *Görünür ki, heç bir yol yoxdur.* Ü.Hacıbəyov. *Yoxdur təbiətdə bu ayrılıqlar; Bütün kainatın bir ahəngi var.* S.Vurğun. *Ay süd kimidir... Bir ləkə yoxdur bənizində; Yerlər də çimir sanki bu dəm nur dənizində.* B.Vahabzadə.
2. Suala mənfi cavab və ya bir şeylə razı olmamağı bildirmək üçün işlənir (*hə, bəli* ziddi). *– Bu axşamkı tamaşaya biletin varmı? – Yox. – Sənə nə olub, xəstə deyilsən ki? – Yox. – Sən bununla razısanmı? – Yox. – Gedəcəksən, ya yox? – Yox, hələ dayan, fikirləşmək lazımdır.* // İnkar edilən şeyin təkrarlanması ilə. *– Sabahkı qonaqlığa gələcəksənmi? – Yox, gəlməyəcəyəm. – Bu işi iki günə görüb qurtarmaq olarmı? – Yox, olmaz.* – [Aslan bəy:] *Yox, hələ də gəlməmiş.* C.Cabbarlı. [Süleyman:] *Yox, xala, daha bu qədər dul qaldın bəsdir.* Ü.Hacıbəyov. // Ümumiyyətlə, etiraz, narazılıq bildirmək üçün işlənir (bəzən təkrar şəklində). *Yox, yox, buna dözmək olmaz. Yox, yox, razı deyiləm. – Yox, yox, mənim fikrimə başqa şey gəlir.* Ü.Hacıbəyov. *Yox, yox, bəsdir, qarı nənə; Bu sözləri demə mənə.* S.Vurğun. // Söylənmiş fikri, sözü düzəltmək üçün işlənir. *Dur get, sabah axşam gələrsən. Yox, ertəsi gün. Bu saat sənə deyim. Yox, özün tap. – Yox, o ağlamırdı. Göynəyirdi*. M.Hüseyn. // Bir şeyi rədd və ya qadağan etməyi bildirir. *– Söz verirəm ki, ... – Yox, söz-zad vermə. – İstəyirəm ki, görüşünə gəlim. – Yox, sən gəlmə, mən özüm gələrəm.* // Cümlədə inkar bildirən xəbərin, yaxud söz birləşməsinin əvəzində işlənir. *O deyir ki, bu saat getmək lazımdır. Mən deyirəm – yox. Sən onu çox dərin adam hesab edirsən. Mən – yox. Bax gör, qayıdacaq, ya yox.*
3. İs. mənasında. *Yoxa çarə yoxdur. Yoxun üzü qaradır. Yoxdan bir şey ortaya çıxarmaq. – Verdilər knyaza* "*yox*" *xəbərini; Ovuşdurub bir az o, əllərini; Əmr etdi qoşuna:* "*Vurun birbaşa!*" H.K.Sanılı.
4. *Bağl. mənasında.* Deyil. *Ona dağ havası yox, dəniz havası xeyirlidir. Bu məsələ tək bizi yox, bütün kollektivi düşündürür. – Amma tək biz yox, bütün əhali qıtlıqdan əziyyət çəkirdi.* M.Hüseyn. *Maya uşaqlıqdan atı sevərdi, lakin yükdaşıyan qoşqu atlarını yox, yallı-yəhərli minik atlarını.* M.İbrahimov.
5. **Yoxam** şəklində – sevmirəm, acığım gəlir, xoşum gəlmir (*varam* ziddi). *Mən buna yoxam.*
6. **Yoxdur** şəklində – 1) cümlədə işi bildirən xəbər mənasında; 2) özündən əvvəlki sözün mənasına müsbətlik çaları verir. *İstisuyun yay aylarında hüsnü yoxdur.*

◊ **Yox a! –** təəccüb, heyrət bildirir. *– Az qala yıxılmışdım. – Yox a!* **Yox demək** – mənfi cavab vermək, rədd etmək, qəbul etməmək. [Rüstəm bəy:] *Qızım, yox deyirsən?* Ü.Hacıbəyov. **Yox deyil** – vardır, mövcuddur, yaşayır. *Yox deyil dünyada; namərd dost, kəmfürsət*

*adam*. R.Rza. **Yox etmək** – puça çıxarmaq, heçə çıxarmaq, məhv etmək, boş yerə sərf etmək. *Varın yox edən sərrafa əvvəl nəzərin var; Sonra həzərin var.* M.Ə.Sabir. *Qaranlıq gecədə buradan qaçaq; Bizi yox etməyi yağı arzular!* H.K.Sanılı. **Yox olmaq** – 1) çıxıb getmək, gözdən itmək; 2) itmək, yoxa çıxmaq, gözdən itmək. *Çoxdandır ki, bu kağız bizim evimizdən yox olmuşdu*. M.S.Ordubadi. *Hamımız alaçıqdan çıxdıq. Qızılquş yox olmuş, uçub getmişdi.* A.Şaiq. *Səlimnaz arvad gəldiyi kimi də yox oldu*. M.Hüseyn; 3) çəkilmək, görünməz olmaq; 4) tükənmək, bitmək. *Yox oldu səbrü sükun həsrəti-dəhanində; Qəmündə qarət olub hər nə var, ey xaliq!* S.Ə.Şirvani. **Yox olmuş** – qarğış ifadəsi. *Neyləyim, axır, bu yox olmuşların; Fikrini qan-qan görürəm, qorxuram.* M.Ə.Sabir. **Yox olsun!** – məhv olsun! rədd olsun! **Yox yerə** – bica, əbəs, nahaqdan, səbəbsiz, heç bir səbəb olmadan. *Aldı əqlü huşumu şövqi-dəhanı dilbərin; Getdi əldən yox yerə məcmui-varım, ey könül!* S.Ə.Şirvani. **Yoxa çəkilmək** – tapılmamaq, qıtlaşmaq. **Yoxa çıxmaq** – görünməmək, itmək, qeyb olmaq, yox olmaq. *Neçə böyük cəzirələr yoxa çıxdı dənizlərdə*. N.Rəfibəyli. **Yoxdan var etmək** – heç bir şeydən yaxşı bir şey vücuda gətirmək, yaratmaq. **Yoxdan yaranmaq** – çox arıq, cılız adam haqqında. **Bu gün var (varam, varsan), sabah yox (yoxam, yoxsan)** – həyatın müvəqqətiliyi haqqında. **Heç yox** – b a x **heç**. **Nə var, nə yox?** – b a x **var**[1]. **Nə yoxdur** – hər şey var. *Mağazalarda nə yoxdur*. **Söz yox** – b a x **söz**. **Söz yoxdur** – b a x **söz**.

**YOXALMA** "Yoxalmaq"dan *f.is.*

**YOXALMAQ** *f.* Yox olmaq, itmək. *Yolda maşınlar dayanır. Düşüb çayxanada dincəlir və təzə dəmlənmiş məxməri çayı içdikcə yorğunluğumuz yoxalır.* S.Rüstəm.

**YOXALTMA** "Yoxaltmaq"dan *f.is.*

**YOXALTMAQ** *f.* Yoxa çıxartmaq, yox etmək.

**YOXLADILMA** "Yoxladılmaq"dan *f.is.*

**YOXLADILMAQ** *məch*. Başqası vasitəsilə yoxlamadan (sınaqdan, müayinədən, nəzarətdən) keçirilmək.

**YOXLAMA** 1. "Yoxlamaq"dan *f.is.* [Xədicə:] *..Sənin beləcə gəlib məni yoxlamandan çox sevindim...* S.Hüseyn.

2. *is.* Bir işin düzgün və qanuni olub-olmadığını, yaxud ümumiyyətlə bir şeyin həqiqi vəziyyətini aydınlaşdırmaq üçün aparılan təhqiqat, təftiş, araşdırma. *Sənədləri yoxlamadan keçirmək. – Yoxlama zamanı Toğrulun xəzinədən israf xərclədiyi və qiymətli şeyləri mənimsədiyi meydana çıxdı.* M.S.Ordubadi.

3. Sınaq, sınama, imtahan, müayinə. *Bu cür yoxlamalar şagirdləri sözlərdə hərf buraxmaq və sözləri təhrif etmək kimi nöqsanlardan xilas edir.* (Qəzetlərdən).

**YOXLAMAQ** *f.* 1. Bir şeyin varlığı – yoxluğu, yaxud düzgünlüyü, həqiqi vəziyyəti barədə yəqinlik hasil etmək üçün onu gözdən keçirmək, təhqiq etmək, müayinə etmək, araşdırmaq. *Hesabatı yoxlamaq. Məsələnin həllini yoxlamaq. Kassanı yoxlamaq. Siyahıda adları bir-bir yoxlamaq. Xəstənin səhhətini yoxlamaq.* // Nəzarət məqsədi ilə təhqiq etmək, təftiş etmək; baxmaq. *İşin gedişini yoxlamaq. İdarənin fəaliyyətini yoxlamaq*. – [Sarxan] *növbədə duran qarovulu yoxlayıb, bəzi tapşırıqlar verdi*. M.Hüseyn. // Eyni məqsədlə araşdırıb baxmaq. *Məndən sonra iki nəfərin də çamadanını yoxladılar*. M.Hüseyn. // Bir şeyin düzgün olub-olmadığını müəyyən etmək üçün nəzarətdən keçirmək. *Biletləri yoxlamaq. Sənədləri yoxlamaq. – Qulam üzüaşağı enib küçədə dəmir sütuna rəbt edilmiş böyük saata baxdı, öz qol saatını yoxladı*. S.Rəhimov.

2. Bir şeyə əl ilə toxunmaq; müəyyənləşdirmək. *Nəbzini yoxlamaq. – Dimdik oturub ətrafımı yoxlarkən əlimə bir heyvan quyruğu toxundu, bu, bir pələng quyruğu idi.* A.Şaiq. *Məsmə arvad əlini can köynəyinin yaxasına salıb üçlüyü yoxladı.* Mir Cəlal.

3. Biliyi, təcrübəni, keyfiyyəti və s.-ni öyrənmək məqsədi ilə təcrübədən, sınaqdan keçirmək. *Şagirdlərin biliyini yoxlamaq. Adamları işdə yoxlamaq*. // Bir alətin, cihazın, maşının və s.-nin saz olub-olmadığı haqqında yəqinlik əldə etmək üçün onu işlədib sınaqdan keçirmək. *Yeni cihazları yoxlamaq. – Əvvəl maşının hissələrini yoxladı, yağladı, bir neçə yerini açıb içəriyə baxdı..* Ə.Sadıq.

4. Götür-qoy etmək, bir şey haqqında ətraflı düşünmək, fikirləşmək. *..Öz məsləhətlərini yoxlayıb bitərəf qalan hökumətlər bunlardır:*

*Şvetsiya, Norvegiya, İran..* C.Məmmədquluzadə.

5. B a x **yoluxmaq²**. *Bir dəfə Nurəddin sərçəni götürüb oynamaq bəhanəsi ilə qaçıb İmamverdi babanı yoxlamağa getdi*. S.S.Axundov. [Məsmə:] *..Həftə nəhayətində onu yoxlamağa getdim. Mən onun səadəti üçün çalışırdım*. S.Hüseyn.

**YOXLANILMA** "Yoxlanılmaq"dan *f.is.*

**YOXLANILMAQ** *məch*. Yoxlama keçirilmək, başqası tərəfindən yoxlanmaq, təftiş edilmək, müayinə edilmək, müayinədən keçirilmək, sınaqdan keçirilmək. *Hərbi təlim dövründən sonra atıcı diviziyası yoxlanıldı..* S.Rəhimov.

**YOXLANMA** "Yoxlanmaq"dan *f.is.*

**YOXLANMAQ** *məch*. Sınanmaq, sınaqdan keçirilmək, imtahandan keçirilmək; yoxlanılmaq. *Burda at çapdı keçən azğınlar; Burda yoxlandı qılınclar, qınlar.* S.Vurğun. *Həsən ilk dəfə yoxlanmaq üçün xor dərnəyinə gələndə, bəzi oğlanlar və qızlar .. gülmüşdülər.* H.Seyidbəyli.

**YOXLATMA** "Yoxlatmaq"dan *f.is.*

**YOXLATMAQ** *icb*. Başqasına yoxlama işi gördürmək. *Sənədləri yoxlatmaq.*

**YOXLAYICI** *sif.* 1. Yoxlama aparan, yoxlamaqla məşğul olan; yoxlayan. *Yoxlayıcı komissiya*.

2. *İs. mənasında.* Sınaqçı. // Təftişçi.

3. Sınayıcı, diqqətli. *Ağca arvad yoxlayıcı nəzərlə Tapdığın uzun .. qıçlarını nəzərdən keçirdi*. Ə.Əbülhəsən.

**YOXLAYIŞ** *is.* Yoxlama işi, təhqiqat, müayinə. *Yoxlayış aparmaq.*

**YOXLUQ** *is.* 1. Yox olma, olmama, bir şeyin olmaması (*varlıq* ziddi). *Məclisdə onun yoxluğu dərhal hiss olundu. – Qaynım həmişəki kimi indi də Midhətin yoxluğunu mənə hiss etdirməyə çalışırdı*. M.Hüseyn.

2. Yoxsulluq mənasında. *Varlıqda dost olmaq, yoxluqda kənar; İyidəm deyəndə bu adət olmaz.* Aşıq Ələsgər.

**YOXSA** *bağl.* 1. Əks surətdə, əks təqdirdə, belə olmasa (olmazsa). *Ey dil ki hicrə doymayıb istərsən ol məhi; Şükr et bu halə, yoxsa gələr bir bəla sana.* Füzuli. *Lazımdır mikrobları millətin bədənindən kənar eləmək! Yoxsa nə göz yaşı tökmək ilə azarlı şəfa tapar, nə dua yazmaq ilə.* C.Məmmədquluzadə. [Pristav:] *Doğrusunu de, yoxsa səni yıxdırıb, o qədər döydürərəm ki, bir ay yorğan-döşəkdə qalarsan.* Ə.Haqverdiyev. [Sərvər:] *Yaz mən deyəni, yoxsa beynini toz eyləyərəm!* Ü.Hacıbəyov.

2. Olmaya, bəlkə (sual yerində). *Yoxsa bizdən incimisən? – Ol bəladır kim, mənim mərhəm bitirməz yarəmi; Yaxsa kim, hər natəvanın dərdi dərmanıncadır.* Qövsi. [Süleyman:] *Balam, nə olub ki, belə qaradinməzcə oturubsan, yoxsa dünyanın dərdi sənə qalıbdır?* Ü.Hacıbəyov. [Gülnaz anasına:] *Nə olub, ana? Yoxsa atamdan pis bir xəbər var?..* M.İbrahimov.

3. Sual cümlələrində ehtimal bildirir – ya, yaxud. *Siz gəlirsiniz, yoxsa mən gəlim? Bu günəmi, yoxsa sabahamı hazır olmalıdır?* – [Məşədi İbad:] *Əşi, siz bu gəlini gətirəndə bir baxmadınız görək bu kişidir, yoxsa arvaddır?* Ü.Hacıbəyov. *Sizi bir elçimi göndərmiş bahar; Yoxsa məftunsunuz ətirli gülə?* N.Rəfibəyli.

**YOXSUL** 1. *is.* Yaşamaq üçün kifayət qədər vəsaiti, imkanı olmayan, ehtiyac içində olan adam; kasıb, möhtac. *Var bu kənddə yenə elə yoxsullar; Nə cütü var, nə kotanı, nə kəli.* A.Səhhət. [Almaz:] *Biz istəyirik ki, kəndimizdə yoxsul qalmasın. Bütün yoxsullar varlansın...* C.Cabbarlı. [Zeynəb deyir:] *Xeyr, yoxsullar iclasında keçibdir, gərək otaqları boşaldasan.* Qantəmir. // Sif. mənasında. *Yoxsul kəndlilər. Yoxsul adam. Əhalinin yoxsul təbəqəsi. – Mirbalayev yoxsul bir kəndlinin oğlu idi*. M.Hüseyn.

2. *sif.* Miskin, kasıb, bəzəyi-düzəyi olmayan, çox sadə. *İçərişəhərdə qaranlıq, dar bir dalanda kiçik bir otaq tutub anamla yoxsul həyat keçirirdik.* A.Şaiq. // Bir şeyi çatışmayan, ya az olan; nöqsanlı, çox məhdud. *Ağıldan yoxsul*. – [Nizami:] *Bu torpağın oğulları hər şeydən yoxsul olsalar da, namusdan yoxsul deyildir!* M.Hüseyn.

**YOXSULLANMA** "Yoxsullanmaq"dan *f.is.*

**YOXSULLANMAQ** *f.* Yoxsul olmaq, kasıblaşmaq.

**YOXSULLAŞDIRILMA** "Yoxsullaşdırılmaq"dan *f.is.*

**YOXSULLAŞDIRILMAQ** *məch*. Yoxsullaşmasına səbəb olmaq, yoxsul hala salınmaq; kasıblaşdırılmaq.

**YOXSULLAŞDIRMA** "Yoxsullaşdırmaq"-dan *f.is.*

**YOXSULLAŞDIRMAQ** *f.* Yoxsul etmək, yoxsul hala salmaq; kasıblaşdırmaq.

**YOXSULLAŞMA** "Yoxsullaşmaq"dan *f.is.*

**YOXSULLAŞMAQ** *f.* Tədricən yoxsul olmaq, yoxsulluğa doğru getmək, yoxsulluğa düşmək; kasıblaşmaq. [Xaqani:] *Şamaxı bazarı zəngin bazardır; Əfsus, yoxsullaşır getgedə bir az.* M.Rahim.

**YOXSULLUQ** *is.* Yoxsul hal, yoxsul vəziyyət; kasıblıq, ehtiyac. *Dünyada heç igid yoxsul olmasın; Yoxsulluq igidə yaman ad olur.* "Koroğlu". *Şirəli də başqaları kimi yoxsulluq, ehtiyac içində böyümüşdü.* M.Hüseyn.

**YOXUŞ** *is.* 1. Yolun dağa, təpəyə qalxan hissəsi; ümumiyyətlə, getdikcə yuxarı qalxan yer (*eniş* müqabili). *Dərənin o biri tayında yoxuşun başında bir atlı dayanmışdı.* Ə.Məmmədxanlı. *Yollar uzun, yoxuş dar.* B.Vahabzadə. // Dik (yer), dikdir. *İndi yuvasından uçacaq quşlar; Min rəngə girəcək düzlər, yoxuşlar.* S.Vurğun. *Bu anda töyşüyə-töyşüyə yoxuşu dırmanan Heydərli Bayrama yanaşdı.* M.Hüseyn. *Cığır* [Nizamini] *bir yoxuşa gətirib çıxardı.* Ə.Məmmədxanlı. // *sif.* Yuxarıya qalxan. *O indi evlərinə tərəf uzanan yoxuş bir cığırı dırmanırdı.* A.Şaiq.

2. *məc.* Çətinlik, dar gün mənasında. *Hər yoxuşun bir enişi olar.* (Ata. sözü).

**YOXUŞ-ENİŞ** b a x **eniş-yoxuş**.

**YOXUŞLU** *sif.* 1. Yoxuşu olan, yoxuşları çox olan. *Yoxuşlu yol.*

2. *məc.* Çətin, əziyyətli. [Müəllim Zərifəyə deyir:] *Həyat yolları yoxuşludur.* H.Seyidbəyli.

**YOXUŞLUQ** *is.* Çoxlu yoxuşu olan yer, yoxuş yer. *Bura çox yoxuşluqdur.*

**YOXUŞSUZ** *sif.* 1. Yoxuşu olmayan, düz. *Yoxuşsuz yol.*

2. *məc.* Çətinliksiz, asan, rahat. [Mirpaşa:] *Yeri, uşaqlarla gəz, dolan bir az; Bu dünya enişsiz, yoxuşsuz olmaz.* Z.Xəlil.

**YOL** *is.* 1. Gediş-gəliş və nəqliyyat işləməsi üçün zolaq şəklində ayrılmış yer. *Kəndarası yol. Bu yol haraya gedir? Avtomobil yolu. Şose yolu.* – [Yusif şah] *əmr elədi ki, hər yerdə yollar təmir olunsun və lazım məqamlarda və mənzillərdə körpülər və karvansaralar tikilsin.* M.F.Axundzadə. *Bağlar arası ilə uzanan bir yolla gedirdim.* S.Hüseyn. ☐ **Yol çəkmək** – şose, yaxud dəmir yolu inşa etmək. **Yol salmaq** – 1) bir yerdən çox gedib-gələrək oranı işlək hala gətirmək; 2) b a x **yol çəkmək**. // Təyyarələrin, gəmilərin hərəkət etdiyi xətt. *Hava yolu. Dəniz yolu. Su yolu.* // Keçiləcək yer, keçid, keçmək üçün yer. *Yolda dayanmaq. Yolu kəsmək. Kolları qırıb yol açmaq. Buzqıran gəminin açdığı yoldan qayıqlar keçdi.*

2. Dəmiryol xətti; rels. *Qatar yolda durmuşdur. Tramvay yolu.*

3. Səfər, səyahət. *Yorucu yol. Yolumuz çox şən keçdi. Yolda heç yatmadıq. Uzaq yoldan gəlmək. – Yolçu yolda gərək.* (Ata sözü). ☐ **Yol üstdə olmaq** – səfərə hazırlaşmaq, səfər ərəfəsində olmaq. *Bala, səhər ertənin soyuğuna özünü vermə! Yol üstdəsən, xəstələnərsən.* Ə.Vəliyev. **Yola çıxmaq** – uzaq bir yerə səfərə getmək. *Rizvan, belə qarlı və çovğunlu havada bir cüt öküzlə yola çıxmağa cürət etmədiyindən, qonşusunun da öküzlərini aldı.* S.Hüseyn. **Yoldan gəlmək** – səfərdən və ya uzaq bir yerdən gəlmək.

4. İstiqamət, yön. ☐ **Yolu azmaq (itirmək)** – azmaq, yolu tanımamaq. *Qayıdarkən yolumu azdım.* S.Hüseyn. // *məc.* Fəaliyyət istiqaməti, inkişaf xətti. *Yazıçı öz yaradıcılığında yeni bir yol seçdi. Hərə öz yolunu tapacaqdır.* // *məc.* İmkan. *Hər bir adam qarşısında geniş yollar açılmışdır.*

5. *anat.* Canlı orqanizmdə: müxtəlif maddələrin keçdiyi boru. *Sidik yolu.*

6. *məc.* Bir yerə girmək, daxil olmaq imkanı. *Yuxarılara yol axtarmaq. – Mənim konsulxanada verilən ziyafətə yol tapa biləcəyimə imkan yaradacaq idi.* M.S.Ordubadi.

7. Bir şeyi əldə etmək üçün üsul, vasitə, vəsait. *İşin yolunu öyrənməli. Məsələni iki yolla həll etmək olar. Bilik əldə etmək üçün əsas yol gərgin əməkdir. Müharibə dövlətlər arasında mübahisəni həll etmək üçün yol ola bilməz.* // Çarə, əlac, tədbir. [Muradın] *qarşısında iki yol vardı; Nigarı boşayıb adını öz üzərindən qaldırmaq və ya onu tamamilə sərbəst buraxıb hər işinə göz yummaq..* S.Hüseyn. ☐ **Yol aramaq** – tədbir düşünmək.

8. *məc.* Dünyagörüşü, əqidə. *O, başqa yolun adamıdır.*

9. *məc.* Dəfə, kərə. *Ondan üç yol soruşdum. Bu gün iki yol çimmişəm. – Əlli yol çapılam, yüz yol talanam; Bir şey deyil dövlət, mal, incimərəm.* Aşıq Ələsgər. *Nə var qoçaq, nə üçün bağırırsan? Bura ki meşə deyil.. İstəyirsənmi peysərinə bir beş-on yol da şapalayım, elə düz gedəsən.* N.Vəzirov. [Koxa:] *Məmmədağa! Başın üçün, nəinki iki-üç və bəlkə on yol demişəm.* N.Nərimanov.

10. ...**yolunda,** ...**yolda** şəklində – uğrunda, üçün, naminə. *Dost yolunda. Yüksək ideallar yolunda. Azadlıq və səadət yolunda. Vətən yolunda canından keçmək. – Dost yolunda bu dünyada; Başından keçdiyin varmı?* "Koroğlu". *Mən axırda arvada dedim ki, dəxi bizim yolumuzda onun zəhmətinə ehtiyac yoxdur.* C.Məmmədquluzadə. *Yarın bahar mövsimidir, aşıq olmalı; Canan yolunda ölmək üçün şaiq olmalı.* A.Səhhət. [Zeyd:] *Bil ki, bu yolda keçərəm; Canımdan, həm varımdan.* Ü.Hacıbəyov.

◊ **Yol açıqdır!** – buyura bilərsən! gedə bilərsən! rədd ol! get! **Yol açmaq** *məc.* – hər hansı bir yenilik sahəsində birinci olmaq; // təşəbbüsçü olmaq, nümunə olmaq, yol göstərmək. *Özünə tapdın əlac, tapdın əlac; Vəliyə sən bir yol aç, sən bir yol aç!* Ü.Hacıbəyov. **Yol ağzında** – yolun yanında, yol kənarında, yola yapışıq yerdə. *Yol ağzında durub gözləmək. – Bostan yol ağzında idi.* Ə.Əbülhəsən. **Yol almaq** – hər hansı bir istiqamətdə hərəkət etmək, getməyə başlamaq. [Yolçu] *şəhər yolundan dönərək kərpic zavoduna yol alır.* Mir Cəlal. **Yol bilmək** – 1) yola bələd olmaq. *Qəhrəman şəhər tanımır, yol bilmir.* S.Rəhimov; 2) tədbirli olmaq, tədbir tapmaq. **Yol döymək** – bir yerə çox gedib-gəlmək. **Yol eləmək** – çox gedib-gəlməkdən yol salmaq; // həddindən artıq gedib-gəlmək. *Dünyanın üstündən yol eylərəm mən; Bu hikmətdə mən Musayam, sən nəsən?* Aşıq Valeh. **Yol göstərmək** – rəhbərlik etmək, yönəltmək, istiqamətləndirmək. **Yol götürüb (alıb, tutub) getmək** – həddindən artıq bol olmaq. **Yol gözləmək** – bir adamın gəlməsini gözləmək, müntəzir olmaq. *Bir təpə başında oturub səbirsizliklə atamın yolunu gözləyirdim.* A.Şaiq. **Yol kəsmək** – 1) çapovulçuluqla, qarətgərliklə məşğul olmaq, soyğunçuluq etmək. *Bəs hansı dilənçilər, görəsən, quldur oldular, yollar kəsdilər?* M.F.Axundzadə; 2) mane olmaq, yol verməmək. *Onun xoşbəxtliyinin yolunu kəsə bilərikmi?* M.S.Ordubadi. **Yol ölçmək** – boş yerə, səmərəsiz gedib-gəlmək. **Yol ötmək** – keçmək, keçib getmək. **Yol tutmaq** – bir tərəfə istiqamət götürmək, getməyə başlamaq. **Yol uzunu** – bütün yolu, yol boyunca. *Atları sürən bir yekəpapaq qoca kişi idi ki, yol uzunu mürgüləyirdi.* C.Məmmədquluzadə. *Yol uzunu söhbətimiz Hacı kişidən idi.* Qantəmir. **Yol üstdə** – b a x **yol ağzında**. *Bağ salmışam yol üstdə; Meyvəsi var bol, üstdə; Gedirəm yar görməyə; Yağı durub yol üstdə.* (Bayatı). **Yol vermək** – 1) başqasının keçməsi üçün kənara çəkilmək; 2) icazə vermək, imkan vermək, mane olmamaq. *Belə şeylərə yol vermək olmaz.* **Yol verməmək** – icazə verməmək, imkan verməmək, mane olmaq. *Qanun buna yol vermir. – Səni beş qrana işlətməyə insafım yol vermir, artığa da gücüm çatmaz.* M.İbrahimov. **Yol vərəqəsi** – ezamiyyətə, sanatoriyaya və s.-yə gedənlərə verilən vəsiqə; putyovka. *Cərrahiyyə professorunun xahişinə görə, Rüxsarəyə Cənubi Krım sahilinə getmək, orada dincəlmək üçün yol vərəqəsi hazırlandı.* S.Rəhimov. **Yol yoldaşı** – bərabər yol gedən (səfərə çıxan) adamlardan hər biri. **Yol yorğunu olmaq** – bir yerə çox gedib-gəldikdə, lakin bir şey əldə edə bilmədikdə deyilən ifadə. **Yola aparmaq** – 1) yaxşı rəftar etmək, yola vermək; 2) idarə etmək. *Adam gərək hər dil ilə olsa filcümlə fəhm və zamanə əhlinin adət və* [xassələrindən] *müttəle olsun, öz işin yola aparsın.* M.F.Axundzadə. **Yola aparmamaq** – yaxşı rəftar etməmək, yola verməmək, daim dalaşmaq, höcətləşmək, sözləşmək. *Günlərin bir günü qızların anası öldü, ataları getdi, təzə arvad aldı. Bu arvad qızları yola aparmadı.* (Nağıl). **Yola düşmək** – getmək, hərəkət etmək. *Sabah yola düşəcəyik. Səyyahlar yola düşdülər. Yola düşməyə hazırlaşmaq. – O adam Şiraza yola düşübdür.* Ü.Hacıbəyov. **Yola düzəlmək** – yola düşmək (ayaqla). *Qasid vidalaşıb yola düzələrkən şair, qıza: – Sən artıq kəniz deyilsən, – dedi.* Ə.Məmmədxanlı. **Yola gedər** – keçər, gedər, ötüşər, razılaşmaq olar. *Nağılbazlığı yola gedər, ancaq ağzıbütöv qoca olsun.* S.Rəhimov. **Yola getmək** – yaxşı rəftar et-

mək; keçinmək, dolanmaq, birlikdə dinc yaşamaq. [Molla Xəlilin] *dediyi kimi, ikisi bir yerdə yola gedə bilməyəcəkdilər..* S.Hüseyn. **Yola getməmək** – bir yerdə ünsiyyət tapa bilməmək, xasiyyətləri tutmamaq, aralarında yaxşı münasibət olmamaq, daim sözləşmək, mübahisə etmək, dalaşmaq. *Onlar heç yola getmirlər. – İslam keçən payızda ikinci bir arvad aldığından, iki günü bir evdə yola getmirdilər*. S.Hüseyn. **Yola gəlmək** – uzun-uzadı fikirləşməkdən, xahişdən, nəsihətdən, söhbətdən sonra razı olmaq, razılıq vermək. [Yığılanlar] *da nə qədər nəsihət elədilərsə, Anaxanım yola gəlmədi*. "Aşıq Ələsgər". **Yola gətirmək** – dilə tutaraq razı etmək, razılığına nail olmaq. *Mənim başım plov bişirməyə qarışacaqdır, sən çalış, onu yola gətir*. S.S.Axundov. [Mirzağa:] *Mən* [Cəmiləni] *tez yola gətirərəm*. S.Hüseyn. **Yola rəvan olmaq** – b a x **yola düşmək**. *Axşama bir saat qalmış yolçular çıxdılar və gecə orada qalıb səhər yola rəvan oldular.* S.S.Axundov. **Yola salmaq** – 1) gedəni qapıya qədər və ya səfərə çıxanı miniyə qədər ötürmək, müşayiət etmək. *Eşitmişik xanımı yola salmısan; Xanım getcək kim, sən tənha qalmısan*. Ü.Hacıbəyov. *O gəmi ilə mən də öz yaralı qardaşımı yola saldım*. M.Hüseyn; 2) təmin etmək, razı salmaq. *Bir badya qatıq doğraması ilə on-on beş fəhləni yola salmaq olurdu.* Mir Cəlal. **Yola vermək** – 1) rəftar etmək, dolandırmaq, idarə etmək. [Mehribanı] *Zeynal istədiyi tərzdə idarə edib yola verməli idi.* S.Hüseyn. [Atam:] "*Quzğun*"*dan bizim evə gələn gənci biz yola verəcəyik, zənnindəyəm.* Çəmənzəminli; 2) ötürmək, üstündən keçmək. *Onun yanında nüfuzdan düşməsin deyə, işi birtəhər zarafatla yola vermək istədi, zorla gülümsündü.* M.Hüseyn; 3) həyata keçirmək, məqsədinə çatmaq. [Kərəmovu] *mütrüb kimi oynadıb ələ salan, öz işlərini yola vermək üçün bir alətə çevirən yaltaqları, ikiüzlüləri çox sərrast təyin etmişdir.* İ.Əfəndiyev. **Yola verməmək** – rəftar etməmək, yola getməmək, ünsiyyət tapa bilməmək. [Anası:] *Bəlkə səni evdə baldızların, qayınların yola vermirlər?* Çəmənzəminli. **Yoldan azmaq** – b a x **yoldan çıxmaq** 2-ci mənada. **Yoldan çıxar(t)maq** – azdırmaq, sapdırmaq, başdan çıxarmaq, müxtəlif yollarla aldadaraq başqa bir işə (adətən pis işə) sövq etmək. *Ağa, başına dönüm, məni yoldan çıxartdılar. Mən bir fəqir, dinc adamam.* M.F.Axundzadə. *Neçə-neçə qərinələrdən bəri müsəlman elə xəyal eləyir ki,* "*Şeytan*" *adında onun bir düşməni var ki, həmişə istəyir, onu yoldan çıxartsın*. C.Məmmədquluzadə. [Həsənqulu bəy:] *Rüstəm bəy, vallah, bağışla, bizi Məşədi İbad yoldan çıxartdı*. Ü.Hacıbəyov. **Yoldan çıxmaq, yolundan çıxmaq** – 1) qəzaya uğramaq. *Qatar yoldan çıxdı;* 2) *məc*. azmaq, sapmaq, pis yola düşmək. *Amandı, qoymayın övladınız azıb çıxa yoldan; Ola bu yaxşı vələdlər yaman, bu boyda, bu boyda*. M.Ə.Sabir. **Yoldan eləmək (etmək)** – 1) b a x **yoldan saxlamaq**. *Bülbülü güldən eylərsən; Gedəni yoldan eylərsən*. Aşıq Həsən; 2) b a x **yoldan çıxar(t)maq**. *Akoşkanın milləri; Açıb qızılgülləri; Oğlanı yoldan eylər; Qızın şirin dilləri.* (Bayatı). **Yoldan qalmaq** – bir səbəb üzündən gedəcəyi yerə gedə bilməmək, yaxud qatara və s.-yə gecikmək. **Yoldan qoymaq** – b a x **yoldan eləmək** 1-ci mənada. **Yoldan ötən, hər yoldan ötən** *məc.* – hər kəs, hər adam. **Yoldan saxlamaq** – getməsinə mane olmaq, getməkdən daşındırmaq. *Şükür Məşədi Həsən əmini yoldan saxlaya bilmədi*. S.Hüseyn. **Yolları ayrılmaq** – aralarında nifaq, ixtilaf əmələ gəlmək. **Yolları (yolu) ayrı olmaq** – məqsədləri, niyyətləri, qayələri başqa-başqa olmaq, bir-birinə uymamaq. **Yolu bir olmaq** – bir məqsəd təqib etmək, bir məsləkdə, bir əqidədə olmaq. **Yolu çaşdırmaq** – hansı tərəfə gedəcəyini bilməmək; azmaq. ...**yolun yolçusu** – b a x **yolçu**. **Yolu düşmək** – təsadüfən gəlmək, getmək, bir yerdə olmaq. *Poçta yolum düşdü və bir açıq kağız alıb kəndimizə, Molla Cəfər rəfiqimizə müxtəsər yazdım..* C.Məmmədquluzadə. *Ax, yolum bir yenə Samuxa düşə; Ürəyim istəyir gedə görüşə..* H.K.Sanılı. ...**yolu ilə** – ...qaydası ilə, ...üsulu ilə, ...kimi. *Dostluq yolu ilə.* **Yolu(n) yumrulsun, yolu yumrulmuş** – qarğış ifadəsi. [Tükəz:] *Çifayda, Əzrailin yolu yumrulsun ki, sənin kimi murdarı yer üzündə qoyub, gözəl cavanları qara torpaq altına yollayır!* M.F.Axundzadə. [Nazlı xanım:] *Dünən olan-olmazımı vermişəm kişiyə, aparsın satsın, kişi də aparıb satıb, yolu yumrulmuş yoldan dönüb Nəcəf bəyin yanına.* Ə.Haqverdiyev. *Yolun yumrulsun,*

*ölüm! Al-qana döndü könlüm.* R.Rza. **Yoluna düşmək (girmək)** – adi halına düşmək, nizam və qaydaya düşmək, normaya düşmək. *Ənisə çox yaxşı bilirdi ki, ər evinə getməklə istər özünün, istər atası Məşədi Əhmədin maddi həyatı qismən yoluna düşə bilər*. S.Hüseyn. **Yoluna qoymaq** – b a x **yoluna salmaq**. **Yoluna salmaq** – nizama salmaq, qaydaya salmaq, davam etdirmək. **Yolundan çıxmaq** – b a x **yoldan çıxmaq**. *Mənim sözüm öz yolundan çıxanı; İnşallah, qaytarar, düz insan eylər*. Aşıq Ələsgər. **Yolunu görmək** – rüşvət vermək. [Həcər:] *Divanbəyinin layiqincə yolun görmək bizim başımız üstə*. M.F.Axundzadə. [Məhəmmədəli:] ..*Qabaqcadan yolumu görməsən, mən səni içəri qoymaram, qardaş!* N.Vəzirov. **Yolunu gözləmək, yolunu saxlamaq** – hörmət etmək, ehtiram etmək. *Özündən böyüyün saxla yolunu; Düşən yerdə saxla ərzi-halını*. Aşıq Abbas. *Rüstəm kişini görən hər bir kəs uzaqdan ona salam verir, yolunu saxlayırdı*. S.Rəhimov. **Yolunu kəsmək** – maneçilik törətmək, mane olmaq, əngəl törətmək. **Axır (son) yol** – ölüm. **Dörd yol ağzı (ayrıcı)** – iki yolun kəsişdiyi nöqtə. **Gözləri yol çəkmək** – b a x **göz**. **Gözləri yolda qalmaq** – b a x **göz**. **Kanat yol** – polad kanatlardan asılmış və onunla hərəkət edən vaqonetlərlə yük (bəzən adam) daşımaq üçün qurğu. *Daşkəsəndə kanat yolu ilə filiz stansiyaya daşınır*. **Nə yolda?** – nə halda? necə? nə vəziyyətdə? [Xan:] *Amerika ticarət müəssisələri ilə olan işlərin nə yoldadır?* M.S.Ordubadi. [Mehriban:] *Zeynal məzuniyyətdən qayıtdıqdan sonra özü ilə əlaqəsi nə yolda olacaqdı?* S.Hüseyn. **Öz yolu ilə (öz yolunda) getmək** – 1) heç kəslə işi olmamaq, heç kəsə toxunmamaq, mane olmamaq; 2) lazımi qaydada, adi yolu ilə getmək. *İşlər öz yolu ilə gedir*. **Yaxşı yol!** – yola (səfərə) çıxana salamatlıq, uğur arzusu.

**YOLAQ, YOLAĞA** *is. məh.* Çəpərdə, hörgüdə basıq və ya uçuq yer; çəpəri, hörgünü basmaqla açılan yol. *Yolaqdan gələn hənirtiyə qarşı onlar .. yerbəyer qalxdılar və həyət qapısına tərəf atıldılar*. S.Rəhimov.

**YOLAYAXIN** *sif.* Sözə qulaq asan; sözeşidən, sözqanan, üzüyola. *Yolayaxın adam*.

**YOLAYAXINLIQ** *is.* Yolayaxın olma, üzüyola olma; üzüyolalıq.

**YOLAYIRAN** *is. d.y.* 1. Relsli yollarda yolu qatarlar üçün açıb-bağlamaqdan ötrü qurğu; yoldəyişən.

2. Bu qurğunu idarə edən dəmiryol işçisi. *Yolayıran öz budkasının yanında durmuşdu*.

**YOLAYOVUQ** b a x **yolayaxın**.

**YOLAYOVUQLUQ** b a x **yolayaxınlıq**.

**YOLAYRICI** *is.* Yolların kəsişdiyi və ya ayrıldığı yer, nöqtə. *Zinyət, xoş gəlmişsiniz! Bəs biz sizi yolayrıcında gözləyirdik.* S.Rəhman.

**YOLBİLƏN** *sif.* və *is.* Təcrübəli, çətin vəziyyətdən çıxmaq çarəsini bilən; tədbirli (adam).

**YOLÇU** *is.* 1. Yola, səfərə çıxmış adam, yol gedən adam. *Yolçu yolda gərək*. (Ata. sözü). *Sevinir keçəndə yolçunun gözü; Seyr edir bu geniş, bəzəkli düzü.* H.K.Sanılı. *Abbas kişinin böyük və səsli şəhərdə rast gəldiyi ilk yolçudan soruşduğu bu oldu.* Mir Cəlal. // Sərnişin, minik. [Konduktor] *uzaqdan gələn yolçulara, görünür, güzəşt edirdi.* Qantəmir.

2. Dilənçi. *Yolçudan yolçuya pay düşməz*. (Ata. sözü). *Ey mənim yolçu, dilənçi, lüt-lüm qardaşlarım həmşərilər!* C.Məmmədquluzadə. ◊ ...**yolun yolçusu** – adətən düz yolla getməyən adam haqqında. [Kələntərli:] *Yoldaş Əmirli, insafla danışın, mən o yolun yolçusu deyiləm.* İ.Hüseynov.

**YOLÇULUQ** *is.* Dilənçilik. *Yolçuluq etmək.*

**YOLDAŞ** *is.* 1. İş, həyat şəraiti ilə bir-birinə yaxın olan adamlar; rəfiq. *Məktəb yoldaşları. Cəbhə yoldaşları. İş yoldaşı. Uşaqlıq yoldaşı. – Yoldaşı yoldaşdan soruşarlar.* (Ata. sözü). *Mənim adım Xəlil və yoldaşımın adı Sadıqdı.* C.Məmmədquluzadə. [Qoçu:] *İki min manat pul verərsən: bir mini mənim, bir mini də yoldaşlarımın.* Ü.Hacıbəyov.

2. Biri ilə birlikdə yola çıxan və ya yol gedən adam. *Əvvəl yoldaş, sonra yol*. (Məsəl). ☐ **Yoldaş olmaq** – biri ilə birlikdə yola çıxmaq, yol getmək, yaxud yol gedən bir adama qoşulmaq. *Şurişin əvvəlinci səbəbi .. miraxur idi ki, küçədə köhnə xəzinədara rast gəlib, ona yoldaş olub soruşdu..* M.F.Axundzadə. *Dəstədən aralanıb arabaçı ilə yoldaş oldum.* S.Hüseyn.

3. **Yoldaşım, yoldaşı** şəklində *dan.* – arvadım (ərim), arvadı (əri). *Yoldaşım hələ işdən*

*gəlməyib. Onun yoldaşı xəstədir.* ◻ **Həyat yoldaşı** – ər, arvad.

4. Sovet cəmiyyətində: vətəndaş, adam. *Bir yoldaş sizi xəbər alırdı. Yoldaşlara deyin tez yığışsınlar. Yoldaşların fikrini bilmək lazımdır. Üç yoldaşdan ibarət komissiya ayrıldı..* // Eyni mənada belə şəxsin familiyası, adı, vəzifəsi qabağında və ya onlardan sonra. *Yoldaş Əhmədov ezamiyyətdədir. Cavadov yoldaş yerindədirmi? Müdir yoldaşı görmək olarmı? – Zeynal üç ay bundan əvvəl, yoldaş Möhsünzadə və Şərifzadənin yanında Mehribana və onun atasına verdiyi sözlərin heç birinə əməl etməyirdi.* S.Hüseyn. // Müraciət etdikdə. *İrəli, yoldaşlar! Yoldaş sədr, xahiş edirəm mənə söz verəsiniz. – Yoldaşlar! İndi də başqa kələk var; Bizə qəpik-quruş göstərir onlar.* S.Vurğun.

◻ "**Yoldaş, al bunu**" – xalq oyunlarından birinin adı. [Gülüqız:] *Bu oyunun adı "Yoldaş, al bunu"dur. Bir dəstə adam oturur. Bir nəfər bilici seçilir. O adamı seçirlər ki, on sözü yadında saxlasın və dalbadal deyə bilsin.* Ə.Vəliyev. "**Yoldaş, səni kim apardı?**" – xalq oyunlarından birinin adı.

**YOLDAŞCANLI** *sif.* Yoldaş sevən, yoldaş, dost üçün canı yanan, yoldaşa sədaqətli. *Nəbi çox yoldaşcanlı adam idi. O istəmirdi yoldaşlarının ayağına tikan batsın.* "Qaçaq Nəbi".

**YOLDAŞCANLILIQ** *is.* Yoldaşcanlı olma, yoldaşının qeydinə qalma, yoldaşa bağlılıq.

**YOLDAŞCASINA** *zərf* Yoldaş kimi, dost kimi, yaxın adam kimi; səmimi. *Yoldaşcasına demək. Yoldaşcasına hərəkət etmək.*

**YOLDAŞCIĞAZ** "Yoldaş"dan *oxş. Yoldaşcığazım azarlayıb. – Dedi bir tülküyə bir gün meymun; Səndə, yoldaşcığazım, çoxdur yun.* A.Səhhət.

**YOLDAŞLAŞMA** "Yoldaşlaşmaq"dan *f.is.*

**YOLDAŞLAŞMAQ** *qarş.* Bir-biri ilə yoldaş olmaq.

**YOLDAŞLI** *sif.* 1. Yoldaşı, rəfiqi, dostu olan. *Sallan, qələm qaşlı, yanı yoldaşlı; Qalmışam ataşlı, mən başıdaşlı...* Aşıq Ələsgər.

2. *Zərf mənasında.* Təkbaşına yox, yoldaşla birlikdə.

**YOLDAŞLIQ** *is.* 1. Yoldaşlar arasındakı əlaqə əsasında əmələ gələn yaxınlıq; dostluq. *Yoldaşlıq duyğusu. Yoldaşlıq vəzifəsi. Yoldaşlıq münasibəti.* – [Süleyman:] *Yox, bu, yoldaşlıq haqqında namərdlik olar.* Ü.Hacıbəyov.

2. Yol, səfər arqadaşlığı; rəfaqət. *Yoldaşlıq etmək.*

◊ **Yoldaşlıq məhkəməsi** *köhn.* – ictimai, qeyri-dövlət məhkəməsi.

**YOLDAŞSIZ** *sif.* Heç bir yoldaşı, dostu olmayan; tək. *Yoldaşsız* (z.) *qalmaq.*

**YOLDAŞSIZLIQ** *is.* Yoldaşı, dostu olmama, yoldaşı, dostu olmayan adamın hal və vəziyyəti; təklik. *Hərgah danışmıram, ona da səbəb yoldaşsızlıqdır.* S.S.Axundov.

**YOLDAŞVARİ** *sif.* və *zərf* Yoldaş kimi, dost kimi. *Sizinlə bir məsələ haqqında yoldaşvari və daha açıq danışmaq istəyirəm.* Ə.Vəliyev.

**YOLDƏYİŞƏN** *is.* 1. *d.y.* Relsli yollarda qatarları bir yoldan başqasına keçirmək üçün qurğu; strelka.

2. Bu qurğunu idarə edən dəmiryol işçisi; strelkaçı. [Qədir] *dəmir yoluna yoldəyişən vəzifəsinə işə girdi.* Ə.Sadıq.

**YOLDURMA** "Yoldurmaq"dan *f.is.*

**YOLDURMAQ** "Yolmaq"dan *icb.*

**YOLDURTMAQ** *icb.* Başqasına yoldurmaq.

**YOLGÖSTƏRƏN** *is.* Rəhbər, başçı, böyük. *Uşağın yolgöstərəni olmadı.*

**YOLXƏRCİ** *is.* Yolda xərclənməsi zəruri olan pul.

**YOL-İZ** *is.* Yol. [Rizvan:] *Hava yağır. Sonra yol-iz tutular, gecəyə düşərik!..* S.Hüseyn. *Qar yağır ağır-ağır; Yollar-izlər ağarır.* H.Hüseynzadə.

**YOLKÁ** [*rus.* ёлка] 1. Yeni il, yaxud xristianların milad bayramı münasibətilə bəzədilən küknar ağacı (bəzən süni materiallardan düzəldilir). // Bu münasibətlə həmin ağac ətrafında düzəldilən şənlik, bayram. *Yolka bayramı.*

**YOLKƏSƏN** *is.* Qarət və soyğunçuluq məqsədi ilə adamların yolunu kəsən şəxs; quldur. *Bütün oğrular, yolkəsənlər, qatillər, zalımlar, müstəbidlər, fırıldaqçılar – hamısı cəhənnəmin vəsfini dönə-dönə eşitmişlər və moizələrə, nəsihətlərə az-çox qulaq asmışlar.* M.F.Axundzadə. *..Oğrular və yolkəsənlər ölkəni çapıb talan elədilər.* F.Köçərli.

**YOLKƏSMƏ** *is.* Quldurluq, çapovul, qarət. *O ətrafda bir yolkəsmə, bir quldurluq olmazdı*

*ki, Əmiraslanın orada əli olmamış olaydı.* S.S.Axundov.

**YOLLAMA** "Yollamaq"dan *f.is.*

**YOLLAMAQ** *f.* Göndərmək. *Məşədi bəyin yolladığı uşaq tez qayıtdı və cavab gətirdi.* M.Hüseyn.

**YOLLANMAQ** 1. *f.* Yola düşüb getmək, bir səmtə istiqamət almaq. *Səhərdir, məktəbə yollanır Xumar; Yanında bir yığın yoldaşı da var.* S.Vurğun. [Səriyyə] *ayaqları əsə-əsə Ayaz və Niyazı yanına saldı. Mitil yorğanı dalına atıb mehmanxanaya tərəf yollandı.* M.İbrahimov.

2. *məch.* Göndərilmək. *Şeylər çoxdan yollanıb. Məktub təyyarə ilə yollanmışdır. – Yetişdi Osmana Əşrəfdən xəbər:* "*Sabah yatab ilə yollanır Əjdər*". H.K.Sanılı.

**YOLLAŞMA** 1. "Yollaşmaq"dan *f.is.*

2. *is.* Razılaşma, razılıq, saziş.

**YOLLAŞMAQ** *qarş.* 1. Yola getmək.

2. Danışaraq razılaşmaq, sazişə gəlmək. *Pullu müştərilər ilə yollaşandan sonra, çervonları alıb yerbəyer edəndən sonra, sarıköynək arvad Qulamın məscidə dönmüş evinə baxıb ürəyində demişdi..* Mir Cəlal.

**YOLLATMA** "Yollatmaq"dan *f.is.*

**YOLLATMAQ** *icb.* Başqası vasitəsilə yollamaq. *Yay olanda dağa yollat! Yaz olanda ifçin nallat!* "Koroğlu".

**YOLLU** *sif.* Yolu olan.

**YOLLUQ** *sif.* Yol üçün, səfər üçün olan, yola götürülən, yola lazım olan. *Yolluq xərc. Yolluq yemək.*

**YOLMA** 1. "Yolmaq"dan *f.is.*

2. *sif.* Çox gödək olduğundan orağa gəlmədiyi üçün əllə dartılıb çıxarılmalı olan. *Yolma taxıl. – ..Onların taxılı bu il gödərək yolma olmuş, dərzləri bəndəmin arasına güclə yığılmışdı.* S.Rəhimov. // *is.* Bu cür taxıl. *Yolmasın yolmaqdan qırıldı belim; Bundan gələn xeyir zəhrimar olsun!* Aşıq Ələsgər.

**YOLMAQ** *f.* 1. Dartıb qoparmaq, çəkib qoparmaq. *Otu yolmaq. Toyuğu yolmaq. – Vur ağzına, düşsün yerə dəndan, nəyə lazım? Yol zülfünü, ol zülfi-pərişan nəyə lazım?* M.S.Ordubadi. *Saxlamış sarayda o qızı bir qış; Qız yolub saçını, təslim olmamış.* S.Vurğun.

2. *məc.* Soymaq, var-yoxunu əlindən almaq, qarət etmək.

**YOLPA** *sif.* Pırtlaşıq saçlı, əzilmiş paltarlı, tör-töküntülü.

**YOLPAN** *is.* Başı kəsilmiş ot, kol. *Qumsal təpələrin qıraqlarını qaratikan kolları və yolpan otları örtmüşdü.* S.Rəhimov.

**YOLPULU** b a x **yolxərci**.

**YOLSUZ** *sif.* 1. Yolu olmayan. *Yolsuz çöllər.*

2. *məc. dan.* Dinsiz, məzhəbsiz (bəzən söyüş yerində işlənir).

**YOLSUZLUQ** *is.* 1. Yolun olmadığı hal.

2. *məc. dan.* Dinsizlik, məzhəbsizlik.

**YOLUXDURMA** "Yoluxdurmaq"dan *f.is.*

**YOLUXDURMAQ** *f.* Başqasına keçirmək, sirayət etdirmək (mikrobu, azarı); yoluxmasına səbəb (vasitə) olmaq. *Qripi yoluxdurmaq.*

**YOLUXDURUCU** *sif.* 1. Keçirən (mikrobu, azarı).

2. Keçirici, yoluxucu, sirayətedici.

**YOLUXDURUCULUQ** *is.* Başqalarına keçirmə (keçmə) qabiliyyəti; keçiricilik.

**YOLUXMA**[1] 1. "Yoluxmaq[1]"dan *f.is.* // Mikrob, azar.

2. *sif.* Yoluxucu, yoluxan, keçici, sirayətedici. *Yoluxma xəstəliklər.*

**YOLUXMA**[2] "Yoluxmaq[2]"dan *f.is. Xəstəni yoluxma.*

**YOLUXMAQ**[1] *f.* Sirayət etmək, keçmək (xəstəlik, mikrob).

**YOLUXMAQ**[2] *f.* Hal-əhval bilmək üçün birinin yanına getmək (gəlmək). *Mirzə Mehdi həkimbaşı həftədə iki-üç dəfə onu yoluxurdu.* Ə.Haqverdiyev. *Arazı yuxuya verdikdən sonra bir də Poladı yoluxmağa getdi.* A.Şaiq. *Hacını yoluxmağa gələn on beş nəfərdən ikisi bayır qapıda bizə rast gəldi.* Qantəmir.

**YOLUXUCU** *sif.* Keçici, başqalarını tuta bilən; sirayətedici. *Qrip yoluxucu xəstəlikdir. Yoluxucu xəstəliklərdən özünüzü qoruyun! – Həkim üzü görməyən, tibb xidmətinin nə olduğunu bilməyən bu yerlərdə bu yoluxucu xəstəlik böyük sürətlə yayılıb, çoxlu qurbanlar aldı.* A.Şaiq.

**YOLUXUCULUQ** *is.* Yoluxma, keçmə, sirayətetmə qabiliyyəti; keçicilik, sirayətedicilik (xəstəlik haqqında).

**YOLUQ** *sif.* 1. Tükləri yolunmuş. *Soyaram libasın, allam sazını; Yal-quyruğun yoluq* (z.) *yola düşərsən.* Aşıq Ələsgər. *İndi bax, qorxundan yoluq cücəyə oxşuyursan.* C.Məm-

mədquluzadə. *Yüz-yüz iyirmi addım uzaqda əl ilə sancılmış kimi, ağaca oxşayan yoluq bir şey seçilirdi*. Mir Cəlal.

3. *məc.* Kasıb, yoxsul, lüt. *Yoluğun nəyi var, şuluğa nə versin?* (Ata. sözü).

**YOLUNMA** "Yolunmaq"dan *f.is.*

**YOLUNMAQ** *məch.* Tükləri dartılıb çıxarılmaq.

**YOLUNMUŞ** *f.sif.* Tükləri dartılıb (çəkilib) çıxarılmış; yoluq. *Yolunmuş toyuq.*

**YOLÜSTÜ** *zərf* Yoldan keçərkən, yanından keçərkən. *Yolüstü yoldaşıma dəydim. Yolüstü bir bizə də gəl. – Yolüstü dəllək dükanına girdi. Üzünü qırxdırıb boynunu, başını düzəltdirdi.* M.Süleymanov.

**YOLVERİLMƏZ** *sif.* Qətiyyən yol verilə bilməyən, dözülə bilməyən, icazə verilməz. *Yolverilməz hərəkət.*

**YOLVURAN** *is.* Qaçaq, quldur, yolkəsən. *Zərəfşan xanımın əri, Camalı məhv etdirmək üçün Qaradağın bütün quldur və yolvuranlarını öz ətrafına yığmışdı.* M.S.Ordubadi.

**YOL-YOL** *sif.* Miləmil, mil-mil; milləri olan. *Xalçanın naxışlı yol-yol haşiyələri gözlərdə parıldayırdı.* Mir Cəlal.

**YONCA** *is. bot.* Paxlalılar fəsiləsindən çoxillik bitki cinsi. *Yonca tarlası. – Şəbistan mərəkdən bir bağlama yonca götürüb tövləyə tərəf yönəlirdi.* S.Rəhimov.

**YONCALIQ** *is.* Yonca bitən yer, yonca tarlası. *Yoncalıqlarda bildirçinlərin və torağayların səsi eşidilirdi.* Ə.Vəliyev. *Kimisi də Hacı kimi, əlindən gedən torpağının, çəmən və yoncalıqlarının ağrısı ilə yatağında ilan çalmış kimi dincəlmək bilmirdi.* Mir Cəlal.

**YONCUMAQ** *f. məh.* Yalvarmaq.

**YONDURMA** "Yondurmaq"dan *f.is.*

**YONDURMAQ** *icb.* 1. Yonma işi gördürmək. *Taxtaları yondurmaq. Ağacı yondurmaq. Dəmiri yondurmaq.*

2. Həkk etdirmək, qazıtdırmaq, yaxud yonmaqla daşdan və s.-dən qayıtdırmaq. [Qəhrəmani Firiduna:] *Gəl aynanın altında, fil sümüyünün üstündə Südabənin şəklini yonduraq, – dedi.* M.İbrahimov.

**YONQA(R)** *is.* Rəndə və s. yonucu alətlərin ağzından çıxan nazik, ensiz taxta parçaları. *Taxta zavodunda gecə-gündüz kəsilən, yonulan taxtaların talaşası, yonqarı dağ kimi qalanıb böyük bir sahəni tuturdu.* Mir Cəlal.

**YONQARLAMA** "Yonqarlamaq"dan *f.is.*

**YONQARLAMAQ** b a x **yonmaq** 1-ci mənada.

**YONQARLANMA** "Yonqarlanmaq"dan *f.is.*

**YONQARLANMAQ** "Yonqarlamaq"dan *məch.*

**YONMA** 1. "Yonmaq"dan *f.is.*

2. *sif.* Yonulmuş.

**YONMAQ** *f.* 1. Bir şeyi (ağacı, dəmiri və s.) həcm etibarilə kiçiltmək, nazikləşdirmək və ya istənilən şəklə salmaq məqsədi ilə xüsusi kəsici, yaxud yonucu alətlə kəsib üstünü götürmək. *Kərim baba fit çala-çala bir qarış iki barmaq qalınlığında yaş çubuğu yonurdu.* A.Şaiq.

2. Daşdan və s.-dən yonmaq yolu ilə hazırlamaq. *Qəhrəmanın heykəlini daşdan yonmaq.*

**YONTALAMA** "Yontalamaq"dan *f.is.*

**YONTALAMAQ** *f. dan.* Tez-tələsik, necə gəldi yonmaq.

**YONTALANMA** "Yontalanmaq"dan *f.is.*

**YONTALANMAQ** *məch.* Tez-tələsik, necə gəldi yonulmaq.

**YONTALANMAMIŞ** b a x **yonulmamış**.

**YONUCU** 1. *sif.* Yonan, yonma işi görən. *Yonucu dəzgah. Yonucu alət, maşın.*

2. *is.* Yonma dəzgahında işləyən, yaxud yonma işində işləyən fəhlə.

**YONUQ** *sif.* Yonulmuş.

**YONULMA** "Yonulmaq"dan *f.is.*

**YONULMAQ** *f.* 1. Rəndə və s. yonucu və ya kəsici alətlə kəsilib üstü götürülmək; hamarlanmaq, işlənmək. *Əmmamə şəklində bir daş yonulmuş; Bir sadə qəbrin üstünə qoyulmuş.* A.Səhhət.

2. Yonularaq hazırlanmaq, qayrılmaq.

**YONULMAMIŞ** *f.sif.* 1. Rəndə və s. yonucu və ya kəsici alətlə kəsilib üstü götürülməmiş; hamarlanmamış, işlənməmiş. *Yonulmamış taxta. Yonulmamış daş.*

2. *məc. dan.* Tərbiyəsiz, mədəniyyətsiz, olduqca kobud, qanmaz. *Fərmanın ürəyi sıxıldı. Dünyada qəribə, yonulmamış adamlar varmış!* Ə.Sadıq.

**YONULMUŞ** *f.sif.* 1. Rəndə və s. yonucu, yaxud kəsici alət vasitəsilə üstü götürülmüş,

düzləndirilmiş; hamarlanmış, işlənmiş. *Yonulmuş taxta.*

2. Yonularaq qayrılmış, düzəldilmiş, həkk edilmiş, qazılmış. *Daşdan yonulmuş heykəl.*

**YONURCA** *is. bot.* Parazit göbələklərin (əsasən taxıllarda) törətdiyi xəstəlik.

**YORĞA** 1. *is.* At yerişinin bir növü (bu yerişdə at növbə ilə gah bir tərəfdəki – sağ ayaqlarını, gah o biri tərəfdəki – sol ayaqlarını eyni zamanda irəli atır).

2. *sif.* Bu cür yerişi olan, bu cür yeriyən. *Yorğa at. Yorğa kürən.* // Zərf mənasında. *Kəhər at yenə də yorğa yeriyir, çayaşağı səkirdi.* Ə.Vəliyev.

**YORĞALAMA** "Yorğalamaq"dan *f.is.*

**YORĞALAMAQ** *f.* 1. Yorğa yerişlə yerimək. [Mayanın] *bütün fikri yorğalayan kəhərdə, gözəlliyindən doymadığı çöllərdə idi.* M.İbrahimov.

2. *məc.* Sürətlə getmək, qaçmaq.

**YORĞALATMA** "Yorğalatmaq"dan *f.is.*

**YORĞALATMAQ** *icb.* Yorğalamağa məcbur etmək, yorğa yerişlə sürmək. // İti sürmək, bərk sürmək.

**YORĞALIQ** *is.* Yorğa yeriyən atın hal və keyfiyyəti. *Atın yorğalığı.*

◊ **Qocalıqda yorğalıq** – b a x **qocalıq**.

**YORĞAN** *is.* Yatanda örtünmək üçün içi yunlu və ya pambıqlı geniş örtü. *Qalın yorğan. Yun yorğan. Üstünə yorğan örtmək. – Ələsgər, ağlayır qızlar, arvadlar; Söküldü döşəklər, yorğan qalmadı.* Aşıq Ələsgər. *Üstümə bir neçə qətrə su atıldı və yorğanın kənarı ilə üzümü sildim.* C.Məmmədquluzadə. *Çəkdik başımıza qalın yorğanı; Dərin bir yuxuya getdik hamımız.* S.Vurğun.

**YORĞANAĞI** *is.* Yorğana keçirilən xüsusi ağ, yaxud onun altından salınan mələfə.

**YORĞANÇA** *is.* Kiçik yorğan, balaca yorğan; uşaq yorğanı.

**YORĞANÇI** b a x **yorğansırıyan, yorğantikən**.

**YORĞAN-DÖŞƏK** *top.* Yorğan, döşək, balışdan ibarət yatacaq ləvazimatı. *Hamı aptekxanalarda taxtabiti tozu satırlar, get bir az al, səp yorğan-döşəyin ətrafına!* N.Vəzirov. [Səlimə:] *Ay Qurban, yuxun gəlirsə, yorğan-döşək salım, bir az yat.* Ə.Haqverdiyev.

◊ **Yorğan-döşəkdən durmaq (qalxmaq)** – sağalmaq. *Heç gör sən gedəndən də bir-iki ay sonra mən yorğan-döşəkdən dura biləcəyəm ki, bir söz də danışam?* "Koroğlu". **Yorğan-döşəyə düşmək (yıxılmaq)** – bərk xəstələnmək. *..Həlimə hamamdan çıxanda özünü soyuğa verib yorğan-döşəyə düşdü.* S.S.Axundov. *Bir az da bu dərdi ilə baş-başa qalardısa, naxoşlayıb yorğan-döşəyə yıxıla bilərdi.* Ə.Əbülhəsən.

**YORĞANIQALIN** *sif. dan.* Havadarı, himayəçisi olduğu üçün əməllərinin üstü açılmayan adam haqqında.

**YORĞANLIQ** 1. *sif.* Yorğana yarayan, yorğan üçün lazım olan.

2. *is.* Yorğana yarayan parça. *Çit yorğanlıq. Yaxşı yorğanlıq almışam.*

**YORĞANSIRIYAN, YORĞANTİKƏN** *is.* Yorğan sırımaqla (tikməklə) məşğul olan adam. *Yorğansırıyan qadın.*

**YORĞANÜZÜ** *is.* Yorğanın üzünə çəkilən adi və ya naxışlı parça. [Mahmud Sonaya:] *Hələ gör sənə nə gətirmişəm: çit, şal, yorğanüzü, tumanlıq...* Z.Xəlil. *Sultanın əli taburetkanın üstündə duran telefon aparatına doğru uzananda ayağı yorğanüzünün cırığına keçərdi.* İ.Hüseynov.

**YORĞANÜZÜLÜK** 1. *sif.* Yorğanüzü üçün yarayan. *Yorğanüzülük parça.*

2. *is.* Yorğanüzü. *Qələmkar yorğanüzülük.*

**YORĞUN** *sif.* Çox işləmək, yerimək, hərəkət etmək və digər fəaliyyət nəticəsində yorulmuş, üzgün düşmüş. *Yorğun adam. Yorğun at. – Qışın soyuğunda da adam istəyir, girsin isti kürsüyə və yorğanı çəksin başına, bir az da yorğun olan adamı yuxu tutur.* C.Məmmədquluzadə. *Yorğun olduğumdan yatdıq gecəni; Səhər açılınca oyatdı məni.* S.Vurğun. *Səməd əmisinin ardınca, yorğun addımlarla yemək otağına keçib stolun yanında oturdu.* İ.Hüseynov. □ **Yorğun düşmək** – yorulmaq. [Xədicə] *axırda yorğun və halsızca düşüb qaldı.* S.Hüseyn. *Yorğun düşmüş qızlar yerlərinə girən kimi gözlərini yumdular.* M.Hüseyn. // *məc.* Keçirdiyi həyəcan və iztirablardan üzülmüş, üzgün düşmüş, yorulmuş.

**yorğun-yorğun** *zərf* Gücdən düşmüş halda, yorulmuş halda, zəifləmiş halda. *Yorğun-yorğun baxmaq.*

**YORĞUN-ARĞIN** *sif.* Çox yorulmuş. *Yorğun-arğın insanlar işdən sonra; Yığışmışdı*

*divarları daş aynalı bir salona.* S.Vurğun. ◻ **Yorğun-arğın düşmək** – çox yorulmaq, taqətsiz düşmək.

**YORĞUNLAMA** "Yorğunlamaq"dan *f.is.*

**YORĞUNLAMAQ** bax **yorğunlaşmaq**. *Ölən öldü, qalanın dərdini dərmanlamışıq; Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.* Ə.Nəzmi.

**YORĞUNLAŞMA** "Yorğunlaşmaq"dan *f.is.*

**YORĞUNLAŞMAQ** *f.* Yorğun düşmək, yorğun olmaq, yorğunluq nəticəsində taqətdən düşmək.

**YORĞUNLUQ** *is.* Çox işləmək, yerimək, hərəkət etmək nəticəsində bədənin gücdən düşməsi, yorulması, yaxud zehnin bir müddət səmərəli surətdə işləyə bilməyəcək hala gəlməsi; üzgünlük, taqətsizlik hissi. *Bədənimin yorğunluğu hələ də getməyib. Cismani yorğunluq. Yorğunluqdan bədənim sızıldayır. – Xanım qızın mənim çöhrəmdə gördüyü dalğınlıq fikirdən deyil, uzun yolun yorğunluğundandır..* M.S.Ordubadi. ◻ **Yorğunluğu çıxmaq** – istirahət etdikdən sonra qüvvəsi özünə qayıtmaq. **Yorğunluğunu almaq** – istirahət etmək. *Abbas bacısına: – Yavaş-yavaş gedərik, orada sən yorğunluğunu alarsan..* S.S.Axundov. **Yorğunluğunu çıxartmaq** – bax **yorğunluğunu almaq**. *İsabala bir az uzandı ki, yol yorğunluğunu çıxartsın.* N.Vəzirov.

**YORMA** "Yormaq[1]"dan *f.is.*

**YORMAQ[1]** *f.* Yorulmasına səbəb olmaq, taqətdən salmaq, tabsız etmək; üzmək. *Atı yormaq. Uşağı çoxlu tapşırıqla yormaq olmaz. Bu iş məni yordu. Yol adamı yorur. – Kinli paşalara meydan oxuyan; Çox köhlənlər yoran qoç Koroğludur.* "Koroğlu". *Məhəmmədhəsən əmi eşşəyi heç kəsə verməzdi ki, bir yana aparıb heyvanı yorsunlar.* C.Məmmədquluzadə. ◻ **Yol yormaq** – çox gedib-gəlmək. [Çarvadar:] *Ə, bu yolu yorduğun bəs deyil?* S.Rəhimov. **Özünü yormaq** *məc.* – boş yerə əlləşmək, əbəs çalışmaq. *Özünü yorma, bundan heç bir şey çıxmayacaqdır.* // Gərgin zəhmət tələb edən bir işdə üstün gəlmək. *Nərddə o məni yordu.*

**YORMAQ[2]** bax **yozmaq**. *Günəş də Qəhrəmanın yuxusunu yorurdu.* Ə.Vəliyev.

**YORNUQ** *dan.* bax **yorğun**. [Süleyman bəy:] *İndi çay içərik, yornuğumuz çıxar.* Ə.Haqverdiyev. *..Biz* [müsəlmanlar] *bəşəriyyət karvanının qatarından üzülmüş yornuq dəvə kimi bir yerdə qalıb, uzun dəhrləri xabiqəflətdə keçirmişik.* F.Köçərli.

**YORT** *sif.* At yerişinin bir növü; löhrəm yeriş (bu yerişdə at bir qabaq ayağı ilə bir dal ayağını eyni vaxtda yerə qoyur).

**YORTAVLAMAQ** *f. məh.* 1. Yorta yerişlə yeriməyə, yortmağa başlamaq. [Məcid] *göy ürkəsinə bir acı qamçı çəkdi. Ürkə yortavladı.* S.Rəhimov.

2. Sürətlə, çapa-çapa getmək. *O, üzünü enişə tərəf döndərib: – Sən bir gör, necə də əti kəsilmiş kimi yortavlayır!* S.Rəhimov.

**YORTDURMA** "Yortdurmaq"dan *f.is.*

**YORTDURMAQ** *icb.* 1. Yortmağa, qaçmağa, çapmağa məcbur etmək. *Sonra bizi yortdurub* [Əmilmərduq] *nəbzimizə baxdı.* Çəmənzəminli.

2. *məc.* Boş-boş gəzməyə məcbur etmək.

**YORTMA** 1. "Yortmaq"dan *f.is.*

2. *sif.* Yort. [Tahir] *..atını yortma yerişlə sürməyə başladı.* M.Hüseyn.

**YORTMAQ** *f.* 1. Yort getmək, yerimək. *Atlar tərpənib bir qədər yortdular.* S.Rəhimov.

2. *məc.* Ümumiyyətlə, yerimək, qaçmaq, boş-boş gəzmək. *O, yenə əvvəlki kimi orabura yortan, ixtisasının adı bulunmayan və qardaşının əlinə baxan Nəsir idi.* S.Hüseyn. [Budaq:] *Şələmiz dalımızda yortmağa üz qoyduq.* Ə.Vəliyev. *Rəhimli fısıldaya-fısıldaya təhkimçinin arxasında yorturdu.* İ.Hüseynov.

3. *məc. dan.* Soxmaq, dürtmək.

**yorta-yorta** *zərf* Tələsik, çaparaq, qaçaqaça. *Yorta-yorta getmək.*

**YORUCU** *sif.* Yorğunluq əmələ gətirən, yoran; ağır. *Yorucu iş. Yorucu yol. Yorucu iclas.* // Üzücü, cansıxıcı, usandırıcı. *Yorucu söhbətlər. Yorucu mənzərə. Yorucu həyat.*

**YORULMA** "Yorulmaq"dan *f.is.*

**YORULMAQ** *f.* Çox işləmək, çalışmaq, hərəkət etmək və s. fəaliyyət nəticəsində yorğunluq hiss etmək, gücdən düşmək. *Gəzməkdən yorulmaq. İşləməkdən yorulmaq. Fikirləşməkdən yorulmaq. – Zeynəb bucaqda ayaq üstə durmaqdan lap yoruldu.* C.Məmmədquluzadə. // Təngə gəlmək, bıqmaq, usanmaq, üzülmək. *Danışmaqdan yorulmadın? – ..Bu Allahın bəlasına giriftar olmuş da yaylaqlarda*

*veyillənməkdən yorulmadı.* C.Məmmədquluzadə. *Bir xeyli sükutdan sonra katib qapıya baxa-baxa dedi: – Nizam-intizam barədə danışmaqdan yorulmuşuq.* M.Hüseyn.

**YORULMAQSIZIN, YORULMADAN** *zərf* Yorulmaq bilmədən, istirahət etmədən, dayanmadan, aram tapmadan, arası kəsilmədən. *Yorulmadan işləmək. Yorulmadan danışmaq.*

**YORULMAZ** *sif.* Yorulmaq bilməyən; yorulmayan. *Yorulmaz tədqiqatçı. Yorulmaz adam.*

**YORULMAZLIQ** *is.* Yorulmaz adamın hal və keyfiyyəti.

**YOR-YOXSUL** *top.* Yoxsullar. *Aşıq Humay indi, bu saat özündən çıxıb yor-yoxsulun başı üstündə qamçı oynadan mülkədar balalarına qan içirmiş Qaçaq Nəbidən deyir, Həcəri tərifləyirdi.* Ə.Vəliyev.

**YOSMA** *sif. şair.* Zərif, incə, işvəli, işvəkar, nazənin. *İpəklər içində xumarlandıqca; Yosma gözəllərə dastanlar deyin.* S.Vurğun.

**YOSMALIQ** *is.* Zəriflik, incəlik, işvəkarlıq; işvə, naz.

**YOSMARAQ** *sif.* Bəstəboylu, kiçik, alçaq.

**YOSUN** *is. bot.* Kökü, gövdəsi, yarpağı olmayan və bununla da başqa su bitkilərindən fərqlənən sporalı su bitkisi, dənizdən çıxan otlar. *Dəniz yosunu.*

**YOSUNLAMA** "Yosunlamaq"dan *f.is.*

**YOSUNLAMAQ** *f.* Yosun bitmək, yosunu bağlamaq, yosunla örtülmək, yosun basmaq.

**YOSUNLU** *sif.* Üstünü yosun basmış, yosunla örtülmüş. *Yosunlu gölməçə.*

**YOSUNVARİ** *sif.* Yosuna oxşayan; tel-tel.

**YOTLAŞDIRMA** *dilç.* "Yotlaşdırmaq"dan *f.is.*

**YOTLAŞDIRMAQ** *f. dilç.* Yot (y) səsi ilə tələffüz etmək.

**YOTLAŞMA** *is. dilç.* Saitlərin qabağında (adətən sözün əvvəlində və ya saitlərin arasında) yot (y) samitinin gəlməsi. *Yotlaşma hadisəsi.*

**YOVQAR** *is.* Taxta yonmaq üçün alət; rəndə, ikidəstəli rəndə.

**YOVM** *is.* [*ər.*] *köhn.* Gün, gecə-gündüz, sutka.

**YOVMİYYƏ** *is.* [*ər.*] *köhn.* 1. Hər gün üçün verilən xərc, haqq, maaş; gündəlik. *Azərittifaqdan göndərilən təftiş komissiyası aylarla oturar, öz yovmiyyəsini alar, bu dairəittifaqın işini əsaslı surətdə yoxlardı.* S.Rəhimov. // *sıf.* Gündəlik. [Hacı Kərim zərgər:] *Mən ki zərgərəm, yovmiyyə xərcimdən ötrü acizəm.* M.F.Axundzadə.

2. Hərgünkü gəlir və çıxarı yazmaq üçün mühasibat dəftəri; gündəlik.

**YOVŞAN** *is. bot.* Mürəkkəbçiçəklilər fəsiləsindən kəskin qoxulu ot və yarımkol bitkisi. *Yovşan arağı* (*distillə yolu ilə yovşandan çəkilmiş cövhər*). *– Muğanda qarağat, yovşan yerinə; Çinarlar boy atdı cərgələnərək.* S.Vurğun.

**YOVŞANLI** *sif.* Çoxlu yovşan bitmiş, yovşan bitən. *Yovşanlı əkin. Yovşanlı yer.* – [Tahir] *pəncərənin qabağında durub boz və yovşanlı təpələrin ardında batan günəşə baxırdısa da, fikri tamam başqa yerdə idi.* M.Hüseyn.

**YOVŞANLIQ** *is.* Yovşan bitən yer.

◊ **Yovşanlığa çıxmaq** – bir işdə, danışıqda və s.-də adi, normal dərəcədən kənara çıxmaq, həddi aşmaq.

**YOVŞUTMA** "Yovşutmaq"dan *f.is.*

**YOVŞUTMAQ** *f.* Yumşaltmaq, dilə tutaraq özünə yaxınlaşdırmaq.

**YOVUQ** b a x **yaxın**. [Hacı Murad:] *Sinni də mənə yovuqdur.* S.S.Axundov.

**YOVUQLAŞDIRILMA** "Yovuqlaşdırılmaq"dan *f.is.*

**YOVUQLAŞDIRILMAQ** b a x **yaxınlaşdırılmaq**.

**YOVUQLAŞDIRMA** "Yovuqlaşdırmaq"dan *f.is.*

**YOVUQLAŞDIRMAQ** b a x **yaxınlaşdırmaq**.

**YOVUQLAŞMA** "Yovuqlaşmaq"dan *f.is.*

**YOVUQLAŞMAQ** b a x **yaxınlaşmaq**.

**YOVUQLUQ** b a x **yaxınlıq**.

**YOVUŞDURMA** "Yovuşdurmaq"dan *f.is.*

**YOVUŞDURMAQ** *icb.* Yaxınlaşdırmaq; yaxınlaşmağa, ünsiyyət bağlamağa məcbur etmək və ya vasitə olmaq. // Uyğunlaşdırmaq.

**YOVUŞDURULMA** "Yovuşdurulmaq"dan *f.is.*

**YOVUŞDURULMAQ** *məch.* Yaxınlaşdırılmaq; yaxınlıq, ünsiyyət yaradılmaq.

**YOVUŞMAQ** *f.* Yaxınlaşmaq, ünsiyyət bağlamaq. ..*Gülgəz* [atasına] *az yovuşardı.* Mir Cəlal. // Uyuşmaq, uyğunlaşmaq, özünü başqası ilə tay, bərabər tutmaq. *Adam adama gərək yovuşsun.*

**YOVUŞMAZ** *sif.* Yovuşmayan, heç kəslə qaynayıb-qarışmayan (adam). *Yovuşmazın biridir.*

**YOZDURMA** "Yozdurmaq"dan *f.is.*

**YOZDURMAQ** 1. "Yozmaq"dan *icb. Yuxusunu yozdurmaq.*

2. *f.* Fikrini başqa şeyə cəlb etmək, azdırmaq, yayındırmaq.

**YOZMA** "Yozmaq"dan *f.is.*

**YOZMAQ** *f.* Özü istədiyi kimi məna vermək, izah etmək, şərh etmək. *Cəhrənin qırılmasını pis yerə yozaraq, ürəyinə gətirmişdi ki, bəlkə də bu saat Tapdığın başında bir xata var!* Ə.Əbülhəsən. // Hiss etmək, duymaq. *Kələntərli müsahibinin qəfildən tutulmasını söhbətdən xoşlanmamasına yozdu.* İ.Hüseynov. // Yuxuda görülmüş şeyə məna vermək, röyanı təbir etmək.

**YOZULMA** "Yozulmaq"dan *f.is.*

**YOZULMAQ** *məch.* İstənilən kimi məna verilmək, izah edilmək, şərh edilmək.

**YÖN** *is.* 1. Üz, üz tərəf, ön tərəf. *Oturub-durub yönü oyana; Durub-durub yeriməyin nədəndir?* M.P.Vaqif. *Gah yönümü çevirirəm Şirvana; Gah üz tutub Gürcüstana, ağlaram.* Molla Cümə. *Gülsənəm arvad yönünü oğluna tərəf çevirmədən cavab verdi və aşağı əyilib ocağı üfürməyə başladı.* M.Hüseyn. ☐ **Yön çevirmək** – üz çevirmək, üzünü tutmaq, müraciət etmək. *Ələsgər, yön çevir şahlar şahına; Yapış ətəyindən, şikayət eylə!* Aşıq Ələsgər. **Yönünü tutmaq** – üzünü.. tərəfə çevirmək. *Hər kəsin dünyada bir qibləsi var; Mən də yönüm sənə sarı tutmuşam.* M.P.Vaqif.

2. İstiqamət, səmt, tərəf. ☐ **Yön almaq** – istiqamət almaq, üz tutmaq, ...tərəfə getmək. *Ertəsi gün sübh tezdən Qaraxan Xırdanı və məni oyatdı. Onlar birlikdə yoncalığa tərəf yön aldılar.* S.Rəhimov.

◊ **Yönü bəri olmaq** *dan.* – sağalmağa başlamaq, sağalmaq əlamətləri göstərmək. *Səs hər yana yayıldı. Padşaha muştuluğa getdilər ki, Qəmərin nəfəsi qayıtmışdır, xırda-xırda yönü bəri olur.* (Nağıl).

**YÖNDƏM** *is.* 1. Qayda, nizam, səliqə. ☐ **Yöndəmdən çıxmaq** – eybəcərləşmək, çirkinləşmək, korlanmaq. **Yöndəmə düşmək** – qaydaya düşmək, səliqəyə düşmək, müəyyən şəklə düşmək. *Yöndəmə düşdükdən sonra universitetə getdim.* Mir Cəlal. **Yöndəmə salmaq (qoymaq)** – səliqəyə, sahmana salmaq, qaydaya salmaq, müəyyən bir şəklə salmaq. *..Mən cəmi işlərimi yöndəmə qoyub, dost-aşnalar ilə vidalaşıb əyləşdim mənzildə.* Ə.Haqverdiyev.

2. Görkəm, sir-sifət, xarici görünüş. *Bunun yöndəminə bax. Bu nə yöndəmdir?*

**YÖNDƏMLİ** *sif.* Səliqəli, qaydalı; görünüşcə yaxşı, abırlı, görkəmli.

**YÖNDƏMLİLİK** *is.* 1. Yöndəmli şeyin hal və keyfiyyəti.

2. Rahat, qolay.

3. Qolaylıq, rahatlıq.

**YÖNDƏMSİZ** *sif.* 1. Qaba, kobud, biçimsiz, səliqəsiz, tənasübsüz. *Yöndəmsiz adam. Yöndəmsiz şey. – Hələ kim olduğunu bilməmişdən bu adamın xarici görkəmi bizdə nifrət əmələ gətirmişdi; kobud sifəti, yöndəmsiz bədəni vardı.* S.Rəhman.

2. Naqolay, narahat, qaydasız, kobud. *Yöndəmsiz hərəkət. Yöndəmsiz* (z.) *oturmaq.*

**YÖNDƏMSİZLİK** *is.* 1. Yöndəmsiz şeyin halı.

2. Naqolaylıq, narahatlıq.

**YÖNƏLDİCİ** *sif.* 1. Hərəkət və istiqamət verən, istiqamətverici, istiqamətləndirici, istiqaməti nizama salan. *Yönəldici göstəriş.*

2. *tex.* Bir şeyi müəyyən istiqamətdə hərəkət etdirən. *Yönəldici çarx. Yönəldici rels. – Quyunu qazmağa başlarkən onun ağzını möhkəmlətmək və gilli məhlul cərəyanını təmin etmək üçün quyuya endirilən ilk qoruyucu borulara yönəldici boru deyilir.* S.Quliyev.

**YÖNƏLDİLMƏ** "Yönəldilmək"dən *f.is.*

**YÖNƏLDİLMƏK** *məch.* Bir səmtə və ya bir şeyə doğru çevrilmək, sövq etdirilmək; istiqamətləndirilmək. *Topların ağzı düşmənə yönəldilmişdir. Tənqid atəşi öz hədəfinə yönəldildi.*

**YÖNƏLMƏ** "Yönəlmək"dən *f.is.*

**YÖNƏLMƏK** *f.* 1. Bir tərəfə istiqamət alıb getmək, üz tutub getmək, istiqamət almaq. *Hamımız səs gələn tərəfə yönəldik. Gəmilər adaya doğru yönəldi. – Koroğlu Nigara tərəf yönəldi.* "Koroğlu". [Faytonun] *içindən İmamverdi baba çıxıb Nurəddinə tərəf yönəldi.* S.S.Axundov. // Bir şey üçün yanaşmaq, yanına getmək, müraciət etmək. [Xortdan:] *Əlində maya düzəltmək üçün qədim dost və aşnalarına yönəldi..* Ə.Haqverdiyev.

2. Gəlmək, üz tutmaq. [Bəkir:] *Qayanın üstündən gördüm, iki dəstə atlı bizə sarı yönəliblər*. N.Vəzirov.

3. Üzünü çevirmək, dönmək, çevrilmək.

**YÖNƏLTMƏ** "Yönəltmək"dən *f.is.*

**YÖNƏLTMƏK** *f.* İstiqamət vermək, istiqamətləndirmək, istiqamət göstərmək. *Suyu arxa yönəltdik; Bağa, bostana getdik; Evin var olsun, qardaş; Axır xoş günə yetdik.* (Bayatı). *Balaca Sabir hiss edirdi ki, daha atası onu məktəbə tərəf yönəltmək istəmir.* S.Rəhimov. // Tuşlamaq, çevirmək, döndərmək. *Topun ağzını hədəfə yönəltmək. – Bir daşa sinə gərib tüfəngimi* [pələngə] *tərəf yönəltdim.* A.Şaiq.

**YÖNLƏŞMƏ** "Yönləşmək"dən *f.is.*

**YÖNLƏŞMƏK** *qarş. məh.* Razılığa gəlmək; razılaşmaq, düzəlişmək.

**YÖNLÜ** *sif. dan.* 1. Yararlı, lazımlı, gərəkli, münasib, əlverişli, yaxşı, əməlli-başlı. *Yönlü şey.*

2. Yaxşı, üzüyola, sözəbaxan. [Əhməd] *ürəyində öz-özü ilə belə bir iftixarla danışırdı: – Ağıllı övlad, yönlü bala adamın qalxması üçün ən sehirli qanad deyilmi?* S.Rəhimov.

**YÖNLÜK**: **yönlük hal** *qram.* – ismin kimə? nəyə? və haraya? suallarına cavab verən halı.

**YÖNSÜZ** *sif.* Yararsız, lazımsız, gərəksiz. // Pis, vecsiz, fərsiz. *Hatəm xan oturduğu yerdə bütün vücudu ilə silkələndi: – Yönsüz oğul neylər ata malını, – dedi.* S.Rəhimov.

**YÖRƏ** *is.* Yan, ətraf, həndəvər (çox vaxt "yan-yörə" şəklində işlənir). *Kərəsidi qoyunun, kürəsidi qoyunun; Ağlığımızdan gəzərik yörəsində qoyunun.* (Sayaçı sözü).

**YÖR-YÖNDƏM** *is. dan.* 1. Xarici görünüş; sir-sifət, qiyafət. *Pasının qırmızı üzü daha da qızardı: – Qadam sənin yörünə-yöndəminə, – dedi.* S.Rəhimov.

2. Səliqə, sahman, qayda.

◊ **Yör-yöndəmə salmaq** – qaydaya (səliqəyə, sahmana) salmaq, abıra mindirmək. *Odur ki, oğlum bağı yör-yöndəmə salır.* "Koroğlu".

**YUBADILMA** "Yubadılmaq"dan *f.is.*

**YUBADILMAQ** *məch.* Ləngidilmək, gecikdirilmək, təxirə salınmaq. *Xəstəni qorxulu hallardan xilas etmək üçün, ona dərhal zəhərin təsirini zəifədən maddə verilməlidir. Bu iş bir anlığa belə yubadılmamalıdır.* (Qəzetlərdən).

**YUBADILMAZ** *f.sif.* Təxirə salınmasına, gecikdirilməsinə, ləngidilməsinə yol verilməyən; təxirsiz, təcili, gecikməz.

**YUBANDIRMA** "Yubandırmaq"dan *f.is.*

**YUBANDIRMAQ** b a x **yubatmaq**. [Quliyev] *heç vaxt smetanın tərtibini yubandırmazdı.*

**YUBANMA** "Yubanmaq"dan *f.is.*

**YUBANMADAN** *zərf* Gecikmədən, ləngimədən; tez, dərhal. *Yubanmadan bunu aparıb yerinə çatdır. Yubanmadan qayıt gəl.*

**YUBANMAQ** *f.* Bir işə vaxtında başlamamaq, tələsməmək; gecikdirmək, ləngimək, gecikmək. *Yubanma, işə başla! – Daxmalarda balıqçılar oyanmış; Bir parası çox gecikib yubanmış.* A.Səhhət. *Xan nökəri çağırıb dedi ki, getsin poçta tərəf və görsün Novruzəli harda qaldı və nə bais oldu ki, belə yubandı.* C.Məmmədquluzadə. [Müəllim:] *Ancaq şərtimiz bu oldu ki, yubanmayıb, təyin etdiyimiz saatda gəlsin, daha məni çox gözlətməsin*. Qantəmir.

**YUBATMA** "Yubatmaq"dan *f.is.*

**YUBATMAQ** *f.* Vaxtında etməmək, vaxtında görməmək; gecikdirmək, uzatmaq, ləngitmək. *İşi yubatmaq. Məktubun cavabını yubatma. Yığımı yubatmaq olmaz.*

**YUBİLEY** [*lat.* yubilaeus, əsli *qəd. yəh.*] Bir hadisənin, yaxud bir şəxsin fəaliyyətinin və s.-nin təntənəli surətdə qeyd edilən ildönümü. *Artistin yubileyini keçirdilər. – Bütün Avropada kəmyab ikən, amma Bakıda; Nə səbəbdənsə bu il oldu firavan yubiley*. M.Ə.Sabir. *1933-cü ildə Azərbaycan teatrının 60 illik yubileyi keçirildi.* M.Arif.

**YUBİLYÁR** *is.* [*lat.*] Yubileyi keçirilən şəxs, təşkilat və s. *Yubilyara təbrik teleqramı göndərmək. Son söz yubilyara verildi. – ..Böyük, kiçik hamı şanlı yubilyarı alqışlamaq və onu öpməyə gəlmişdi.* Mir Cəlal.

**YUBKA** [*rus.* əsli *fr.*] Beldən aşağı geyilən qadın geyimi, arvad tumanı. *Xanpəri tez ayağa durub yubkanın ətəklərini dəstələdi.* Ə.Vəliyev. *Züleyxa da həvəssiz halda əlini Fərmana uzatdı və yubkasını səliqə ilə yığışdırıb, skamyanın üstündə əyləşdi.* Ə.Sadıq.

**YUDURTMA** "Yudurtmaq"dan *f.is.*

**YUDURTMAQ** "Yumaq"dan *icb*. *Paltarları yudurtmaq. Pəncərələri yudurtmaq.* – [Arvadı] *burada sözə tutub qızın əlini-üzünü yudurdardılar.* R.Əfəndiyev.

**YUFT** *is.* Qaramal, at və donuz dərisinin aşı maddələri ilə emalından alınan materiallar.

**YUXA** *is.* 1. Nazik yayılmış (mayasız) xəmirdən sacda bişirilən çörək növü; yayma. *Yuxa, yuxa, yolda tıxa.* (Ata. sözü). *Aradan bir az keçməmişdi ki, Səhnəbanının anasını yuxa üstünə apardılar*. "Aşıq Ələsgər". *Göyçək arvad bir büküm yuxanın arasına cızdaq doldurub poçtalyona uzatdı.* Ə.Vəliyev. *Mələk qarı təzə buğda unundan xəmir edib sacda yuxa bişirirdi*. S.Şamilov.

2. *məc.* Yumşaq, nazik, zərif şey haqqında. *Əmanət, əmanət; növki-müjkanın; Toxunmasın, qanar, yuxa üzünə*. Q.Zakir. [Ovçu:] *Qızım, – dedi, – ürəyiniz yuxa olur, bilirəm, amma* [quşlar] *bizim üçün yaranmışdır.* Mir Cəlal. [Rüstəm:] *Hava da bərk dolub, yağacaqdır. Əynin də yuxadır.* S.Rəhimov.

**YUXAÇI** *is.* Yuxa bişirib satan adam.

**YUXALAMA** "Yuxalamaq"dan *f.is.*

**YUXALAMAQ** *f.* Yuxa yaymaq.

**YUXALIQ** *is.* Yuxa üçün yararlı olan. *Yuxalıq xəmir.* // ...yuxaya çatacaq qədər. *Dağarcığın dibində on-on beş yuxalıq un, iki bişirimlik düyü qalmışdır*. Ə.Abasov.

**YUXALMA** "Yuxalmaq"dan *f.is.*

**YUXALMAQ** *f.* Yumşalmaq, nazikləşmək, incəlmək. ☐ **Ürəyi yuxalmaq** – kövrəlmək, riqqətlənmək, təsirlənmək. *Kamran üzünü çevirib ondan uzaqlaşanda koxanın ürəyi yuxaldı*. Ə.Əbülhəsən. *Hər il yay tətili zamanı xalasının yanında olmasına baxmayaraq, birinci dəfə idi ki,* [Budağın] *ürəyi bu qədər yuxalırdı*. Ə.Vəliyev.

**YUXALTMA** "Yuxaltmaq"dan *f.is.*

**YUXALTMAQ** *f.* İncəltmək, nazikləşdirmək. *Bəsdir, ürəyimi yuxaltdın.*

**YUXARI** 1. *sif.* Üst, üstdə olan, yüksəkdə olan, yuxarıda olan. *Yuxarı mərtəbə. Gəminin yuxarı göyərtəsi.* – [Qərənfil xala] *cəld yuxarı otağa çıxdı.* Ə.Vəliyev. // Zərf mənasında. *Yuxarı qaldırmaq. Yuxarı çıxmaq. – ..Kərbəlayı Heydər çıxardı küçəyə, sağ əlinin şəhadət barmağını yuxarı qovzuyub ancaq mənə bircə bunu deyərdi ki,* "*Qırışmal! Uşağı döymə!*" C.Məmmədquluzadə. *Zeynal könülsüz addımlar ilə sakin olduğu evin pilləkənlərini yuxarı çıxırdı.* S.Hüseyn. *Biçənəklərdə ot dizdən yuxarı qalxmışdı.* M.İbrahimov.

2. *Qoş. mənasında.* Artıq, çox. *İclasda yüzdən yuxarı adam iştirak edirdi. Bir saatdan yuxarı gözlədim. – Dən düşmüş saqqalı, sallaq bığları; Göstərir yaşını qırxdan yuxarı.* H.K.Sanılı. ☐ **Yuxarı tutmaq** – üstün tutmaq. *Zeynal öz mənliyini hər şeydən yuxarı tuturdu.* S.Hüseyn.

3. *sif.* Vəzifəcə, mənsəbcə, dərəcəcə yüksək, üstün. *Yuxarı siniflər. Yuxarı təbəqələr. Yuxarı vəzifəyə qoymuşlar.*

4. *is.* Bir şeyin yuxarı, üst, yüksək hissəsi, yeri, təpəsi. *Pilləkənin yuxarısı. Dağın yuxarısında qar var.*

5. Yerlik halda: **yuxarıda** – irəlidə, qabaqda, əvvəldə. *Yuxarıda deyildiyi kimi. Yuxarıda bu barədə yazılmışdır. – Yuxarıda zikr etdiyimiz keyfiyyəti Mirzə özü nağıl edərdi.* Ə.Haqverdiyev.

6. Cəmiyyətin, təşkilatın yüksək, rəhbər dairələri; yüksək vəzifələr, mövqelər (bəzən cəm şəklində işlənir). *Yuxarılardan göstəriş almaq. Yuxarıya müraciət etmək lazımdır.* – [Məmişov:] *Sən ki mənimlə kəc başladın, mən də səni yuxarılara keçirərəm.* M.İbrahimov. [Gəldiyevin] *fikri həmişə yuxarıda, böyüklərdə idi.* Mir Cəlal.

◊ **Yuxarıdan baxmaq** – bəyənməmək, xor baxmaq, həqarətlə baxmaq, saymamaq. *Məktəbdə hər dərsdən zəif olan bir tənbəlin belə yuxarıdan baxmağı Səltənətə güllə kimi dəydi.* Mir Cəlal.

**YUXARIBAŞ** *zərf* Otağın baş tərəfi, məclisin ən hörmətli yeri. *Yuxarıbaşda sandalya üstə əyləşib həzrət Əşrəf.* C.Məmmədquluzadə. *Molla Güləndam bacı məktəbin yuxarıbaşında oturub köynək tikirdi*. Çəmənzəminli.

**YUXARIDAKI** *sif.* 1. Yuxarıda (üstdə), yuxarı (üst) tərəfdə, yuxarı (üst) qatda olan. *Yuxarıdakı qonşular. Yuxarıdakı kitabı mənə ver.*

2. İrəlidəki, qabaqdakı, əvvəldəki. *Yuxarıdakı söhbət aramızda qalsın.* // *is.* Yuxarıda haqqında danışılan məsələ. *Yuxarıdakıları nəzərdən qaçırma.*

**YUXARIKI** *sif.* Yuxarıda, yüksəkdə, hündürdə olan. [Şiraslan öz-özünə deyirdi:] *Əgər o yuxarıkı turşsu, bax, o qocaman palıdın*

*altında olsaydı, .. onda bütün yolçular burada əylənər*(*dilər*). S.Rəhimov.

**YUXU** *is.* 1. Dövraşırı yatmaq şəklində davam edən fizioloji hal (bu zaman beyin – şüur tamamilə, ya da qismən fəaliyyətdən qalır, bir sıra fizioloji proseslər zəifləyir və bədən dincəlir). *Yuxudan ayılmaq. Yuxu zamanı. Yuxuda və ayıqlıqda. Uşağa yuxu lazımdır. – Bəs ki verməz yuxu göz açmağa fürsət kimsəyə; Sübh gün şəmilə hər gün çeşmi-bidar axtarır.* Qövsi. *Bunlar yuxudan ayılır, dava başlanır.* Ü.Hacıbəyov. ◻ **Yuxun(uz) şirin olsun!** – yatmağa gedənlərə rahat yuxu arzusu. **Yuxusu gəlmək** – yuxulamaq, yatmaq ehtiyacı hiss etmək. *Yuxun gəlməmiş yerini sal.* (Ata. sözü). **Yuxusu qaçmaq** – hər hansı bir səbəb üzündən, yaxud səbəbsiz yuxusu pozulmaq, daha yatmaq istəməmək. *Şairin gözündən yuxusu qaçmış; Hərbin əjdahası, qorxunc, dəhşətli; Cəhənnəm sayağı ağzını açmış.* Şəhriyar. **Yuxusuna haram qatmaq** – 1) b a x **yuxu qaçırtmaq**; 2) vaxtından tez ayılmaq. **Yuxusunu almaq** – yatıb dincəlmək, doyunca yatmaq. **Yuxusunu qaçırtmaq** – yuxusunun pozulmasına səbəb olmaq. **Yuxuya batmaq** – bərk yuxulamaq, yatmaq. **Yuxuya getmək** – mürgüləyərək yatmaq, yuxulamaq. *Paşa göy otun üstündə uzandı, gün kürəyinin arasını qızdıranda şirin yuxuya getdi.* "Aşıq Ələsgər". **Yuxuya qalmaq** – yatıb qalmaq, vaxtında oyana bilməmək. *Həmişə dan yerinə səda düşəndə ayaq üstündə olub qapı-bacada hərlənən qız* [Salatın], *yatıb yuxuya qaldı.* İ.Şıxlı. **Yuxuya vermək** – 1) yuxulatmağa çalışmaq, gözü yuxuya gedincə gözləmək. [Şahqulu:] *Meyitini görüm, mən heç sarsaq deyiləm... Bircə de görüm, gecələr bizi yuxuya verib bəyimin otağında nə qayırırsan?* N.Vəzirov; 2) *məc.* yuxulatmaq, iğfal etmək, aldatmaq. **Gözlərindən yuxu tökülmək** – bərk yatmaq istəmək. **Gözünə yuxu getmək** – yuxulamaq. *Gözümə necə yuxu getdiyini xatırlamıram.* M.Hüseyn. **Gözünə yuxu getməmək** – yuxulaya bilməmək, yata bilməmək, yuxusu qaçmaq. [Çərkəz] *yorğana bürünən kimi xoruldadı. Şamxalın isə gözünə yuxu getmədi, arxası üstə uzanaraq əllərini başının altında daraqladı.* İ.Şıxlı. **Qəflət yuxusu** – b a x **qəflət**. **Qış yuxusu, yay yuxusu** – qışda və ya yayda bəzi heyvanlarda əmələ gələn yuxululuq (uyuşuqluq) halı. **Ölü kimi yatmaq** – çox bərk və rahat yatmaq.

2. B a x **yuxugörmə**. *Dəhşətli yuxu. Yuxuya inanmaq. Yuxusunu yozmaq. – Yuxunun yanlışı olar, yalanı olmaz!* (Ata. sözü). [Mərcan bəy:] *Görəsən, bu yuxudur, yoxsa gerçəkdir?* Ü.Hacıbəyov. ◻ **Yuxu görmək** – yuxuda ikən cürbəcür şeylər (hadisələr, surətlər və s.) görmək. *Bu gecə pis yuxu gördüm.* – [Mərcan bəy:] *Yox-yox, bu, yuxudur... Mən yuxu görürəm.* Ü.Hacıbəyov. **Yuxusu çin olmaq** – yuxuda gördüyü şey həyata keçmək. **Yuxusuna da gəlməmək (girməmək)** – heç xəyalında da olmamaq, heç düşünməmək, ağlına belə gətirməmək. **Yuxusuna girmək (gəlmək)** – bir şeyi yuxuda görmək. *Bakıdan beş gün ayrılanda yuxuma Xəzər girir.* N.Rəfibəyli. // Qeyri-real, xəyali, gerçək olmayan şey haqqında. *Bunların hamısı bir yuxu imiş.* ◻ **Yuxusunda da görməmək** – heç ağla gəlməyən, mümkün hesab edilməyən şey haqqında. *Utanmaq bilməzlər, həya etməzlər, insaf, vicdan, mürüvvət heç yuxularına da girməz.* N.Vəzirov.

◊ **Yuxu kimi (gəlmək)** – tamamilə unudulmuş bir şey, hadisə haqqında. *Bu əhvalat adama yuxu kimi gəlir.*

**YUXUCUL** *sif.* Çox yatan, yatmağı çox sevən. *Yuxucul adam.*

**YUXUCULLUQ** *is.* Yatmağı çox sevmə.

**YUXUGƏTİRƏN, YUXUGƏTİRİCİ** *sif.* Yuxulatmaq xassəsi olan; yuxuladan, yuxuladıcı. *Yuxugətirən dərman.*

**YUXUGÖRMƏ** *is.* Yuxuda görülən şey; röya.

**YUXULAMA** "Yuxulamaq"dan *f.is.*

**YUXULAMAQ** *f.* Yuxuya getmək; yatmaq, uyumaq. *Uşaq yuxuladı. – Oğul, oğul, amandır; Çox yuxulamaq yamandır.* M.Ə.Sabir. *..Qızların ikisi Zeynəbin qucağında şirin yuxuladılar.* C.Məmmədquluzadə. [Xəstənin] *yuxuladığı, ya halsız düşdüyü məlum deyildi.* Mir Cəlal.

**YUXULATMA** "Yuxulatmaq"dan *f.is.*

**YUXULATMAQ** *icb.* Yuxulamağa məcbur etmək, yuxu gətirmək. *Dərman adamı yuxuladır. Uşağı yuxulat.*

**YUXULU** *sif.* və *zərf* 1. Yatmış halda (olan), yaxud yatmış halda ikən. *Yuxulu uşaq. Yuxulu halda danışmaq. – Kəramət uşaqlarını ancaq yatdıqları yerdə, yuxulu olduqları vaxt oxşayar, öpərdi.* Ə.Əbülhəsən. // Yarıyatmış, yarıayıq, hələ tamam ayılmamış, yuxudan doymamış. *Yuxulu halda soruşdu. Yuxulu gözləri ilə baxdı.* – [Əvəz kişi] *yuxulu gözlərini ova-ova soruşdu: – Yenə nə var, ay arvad, yuxu görmüsən, nədir?* Ə.Vəliyev.

2. *məc.* Key, süst.

**YUXULULUQ** *is.* Yuxulu halda olma, yuxulu vəziyyət.

**YUXULU-YUXULU** *zərf* Yuxudan hələ ayılmamış bir vəziyyətdə, yuxulu halda. *Yuxulu-yuxulu hara gedirsən? Yuxulu-yuxulu durub qapını açdı.*

**YUXUPİŞİYİ** *is. zar.* Çox yatan, yatmağı çox sevən adam haqqında. *O, lap yuxupişiyidir.*

**YUXUSUZ** *sif.* Yatmadan keçirilən; uyqusuz. *Yuxusuz gecələr çıxdı qarşıma; Fəqət töyşümədi bu polad sinəm.* S.Vurğun. // Yatmayan, yuxulamayan, yuxu bilməyən, ən ayıq; oyanıq. *Yuxusuz qarovulçular. – Yuxusuz maraltək hərdən süzülüb; Axan gözlərinin sədəqəsi canım.* Q.Zakir. // Zərf mənasında. *Gecəni yuxusuz keçirmək. – O gecəni Bəxtiyar səhərədək yuxusuz qaldı.* S.Hüseyn.

**YUXUSUZLAMA** "Yuxusuzlamaq"dan *f.is.*

**YUXUSUZLAMAQ** *f.* Yuxusuz olmaq, yuxu həsrətində olmaq.

**YUXUSUZLANMA** "Yuxusuzlanmaq"dan *f.is.*

**YUXUSUZLANMAQ** b a x **yuxusuzlamaq**.

**YUXUSUZLAŞMA** "Yuxusuzlaşmaq"dan *f.is.*

**YUXUSUZLAŞMAQ** *f.* Getdikcə yuxusuz olmaq, yuxusu azalmaq, az yatmaq.

**YUXUSUZLATMA** "Yuxusuzlatmaq"dan *f.is.*

**YUXUSUZLATMAQ** *icb.* Yuxudan məhrum etmək, yuxusunu əlindən almaq, az yatmağa məcbur və ya vərdiş etdirmək.

**YUXUSUZLUQ** *is.* Uyumama, uyuya bilməmə, yuxusu olmama; uyqusuzluq. *Yuxusuzluq qocalarda daha çox olur. Yuxusuzluqdan əziyyət çəkmək. – Uruzu yuxusuzluqdan aclıq və yorğunluqdan çox, çəkdiyi mənəvi iztirablar sıxmışdı..* M.Rzaquluzadə. *Səməd arıqlamış, yuxusuzluqdan gözlərinə qan sağılmışdı.* İ.Hüseynov.

**YUKAGİR** Yakutiyada yaşayan şimal xalqlarından biri və bu xalqa mənsub adam. *Yukagir dili.*

**YUKKA** *is.* [*lat.*] *bot.* Həmişəyaşıl bitki cinsi.

**YUQOSLAV** Yuqoslaviya əhalisinə mənsub adam.

**YULAF** *is. bot.* At yemi kimi istifadə edilən, habelə dənindən yarma hazırlanan dənli bitki. *Yulaf samanı. Yulaf əkini.*

**YULAFLIQ** *is.* Yulaf əkilmiş yer, yulaf əkini.

**YULĞUN** *is. bot.* Quraqlığa və şoranlığa davamlı xırda salxım şəklində çiçəkləri olan kol bitkisi. *Yulğun ağacı. – Toz basmış tikan, yulğun kolları – ..hamısı, deyəsən, dünənkilərdir.* Mir Cəlal.

**YULĞUNLUQ** *is.* Yulğun bitmiş yer, yulğun kolluğu.

**YUMAQ**[1] *f.* 1. Su və ya su və sabun, yaxud başqa bir maye ilə təmizləmək. *Əllərini yumaq. Əl-üzünü yumaq. Ayaqlarını yumaq. Paltar yumaq. – Bahadır üzünü yuyub çay içməyə getdi.* N.Nərimanov. *Bir həyətdə bir müsəlman arvadı arxın kənarında qab yuyurdu.* C.Məmmədquluzadə. *Müşgünaz başını yuyub quruladıqdan sonra güzgünün qabağına gəldi.* Ə.Vəliyev.

2. Çarparaq, toxunaraq dağıtmaq, aparmaq (yağış, dəniz, çay). *Dalğalar sahili yuyur. – Su bütün əkinləri yuyub aparmışdı.* Ə.Sadıq.

3. *məc.* Əvəzini vermək, doğrultmaq ("günahını", "təqsirini" sözləri ilə). [Heydər bəy:] *Naçalnik, mən hazıram ki, bu təqsirimi öz qanım ilə .. yuyam.* M.F.Axundzadə. [Əxistan:] *Söyləsin bir mənə əyan Səbahi; Neylə yuyacaqdır ağır günahi?* M.Rahim.

**YUMAQ**[2] *is.* Top kimi sarınmış sap, ip və s. *Bir yumaq yun ip. – Keçəlin anası gündə bir yumaq əyirərdi, keçəl aparıb onu bazarda satardı.* (Nağıl).

◊ **Yumağa dönmək** – büzüşmək, yığışmaq, kiçilmək. [Əhməd:] *Rüstəm bəy kimi pəhləvanın beli bükülüb, özü dönüb bir yumağa.* N.Vəzirov. *O, kinindən büzüşdükcə bir yumağa dönür bəzən.* S.Vurğun.

**YUMAQCA** *is.* Balaca yumaq.

**YUMAQLAMA** "Yumaqlamaq"dan *f.is.*

**YUMAQLAMAQ** *f.* Sapı sarıyıb yumaq halına salmaq. *Hisli-paslı alçaq bir damda oturmuş Fatı əlində ip yumaqlayır.* Ə.Abasov.

**YUMAQLANMA** "Yumaqlanmaq"dan *f.is.*

**YUMAQLANMAQ** 1. *məch.* Sarınıb yumaq halına salınmaq, yumaq düzəldilmək.

2. *qayıd. məc.* Yumağa dönmək, yığılıb yumaq kimi olmaq.

**YUMALAQ** *is.* Ovuc içində yumrulanmış yumşaq şey (mum və s.).

**YUMALAMA** "Yumalamaq"dan *f.is.*

**YUMALAMAQ** bax **yumbalamaq**. *Dağlardan axan sellər alaçıqlara dolub bəzilərini yumalayıb aparır.* S.S.Axundov.

**YUMALANMA** "Yumalanmaq"dan *f.is.*

**YUMALANMAQ** *f.* Diyirlənmək, yumbalanmaq. *Ayı eniş aşağı qaça bilmədiyindən dərənin içinə yumalandı.* S.S.Axundov. *Buradan çıxarılan daşlar üstdən aşağı yumalanır və dərənin dibində bənd alırdı.* S.Rəhimov. *Bu zaman .. daş qopub üzüaşağı yumalandı.* Ə.Məmmədxanlı.

**YUMARLAMA** "Yumarlamaq"dan *f.is.*

**YUMARLAMAQ** *f.* 1. Gillətmək, diyirlətmək, yumbalamaq. *İlan kimi qıvrılıb açılan dalğalar Nəbini öz qoynunda yumarlaya-yumarlaya* (z.) *aparırdı.* Ə.Abasov.

2. Yumrulamaq, girdələmək, yumru etmək.

**YUMBALAQ** *is.* Başı üzərindən aşma hərəkəti.

**YUMBALAMA** "Yumbalamaq"dan *f.is.*

**YUMBALAMAQ** bax **yumbalatmaq**.

**YUMBALANMA** "Yumbalanmaq"dan *f.is.*

**YUMBALANMAQ** *f.* Başı üstə çevrilə-çevrilə gəlmək, dombalaq aşmaq, kəlləmayallaq gəlmək. [Qəhrəman:] *Bir güllə atdım, birini də, .. hərif gurultu ilə pilləkənlərdən yumbalanaraq otağa düşdü.* H.Nəzərli. // Diyirlənə-diyirlənə gəlmək, gillənə-gillənə getmək. *İndi* [Muradın] *ardınca böyük, kiçik daşlar yumbalanırdı.* S.Hüseyn.

**YUMBALATMA** "Yumbalatmaq"dan *f.is.*

**YUMBALATMAQ** *f.* Diyirlətmək, gillətmək. *Dağdan daşları aşağı yumbalatmaq.*

**YUMDURMA** "Yumdurmaq"dan *f.is.*

**YUMDURMAQ** *icb.* Yummağa məcbur etmək; qapatmaq. *Ağzını yumdurmaq. Gözlərini yumdurmaq.*

**YUMMA** "Yummaq"dan *f.is.*

**YUMMAQ** *f.* Qapamaq, örtmək. *Gözlərini yummaq. Ağzını yummaq. – Məst ol gecə-gündüz, nə bilim, yat nərələrdə; Yum gözlərini xaneyi-viranını görcək.* M.Ə.Sabir. *Çöhrəsindən sızan bu qan bəs nədir? Onun gözlərini yuman bəs nədir?* M.Rahim.

◊ **Göz açıb-yumunca** – bax **göz**.

**YÚMOR** [*ing.* humour] 1. Hadisələri, nöqsanları, zəif cəhətləri və s.-ni gülməli, məzəli, əyləncəli şəkildə təsvir etmə bacarığı; mizah. *Onda böyük yumor var. Bu adamda yumor deyilən şey yoxdur.*

2. Ədəbi, yaxud incəsənət əsərində bir şeyi gülməli, məzəli şəkildə təsvir etmək əsasında qurulmuş bədii yaradıcılıq üsulu, habelə bu üsuldan istifadə edən ədəbi, yaxud incəsənət əsəri. *Yumor və satira. Molla Nəsrəddinin yumoru. Musiqi yumoru. Sirk tamaşasının yumoru.*

**YUMORÉSKA** [*alm.* humoreske] Yumor mahiyyətində olan əsər (kiçik hekayə, musiqi əsəri).

**YUMORÍST** [*ing.* humorist] Həyati hadisələri gülməli, məzəli şəkildə təsvir edən yazıçı, artist.

**YUMORİSTÍK** *sif.* Yumor mahiyyətində olan; gülməli, məzəli. *Yumoristik hekayə.*

**YUMORÍSTİKA** [*fr.* humoristique] Yumor mahiyyətində olan bədii ədəbiyyat. *Estrada yumoristikası.*

**YUMRU** 1. *sif.* Yuvarlaq, girdə, kürə, top şəklində. *Yumru güllə. Yumru daş. Yumru gilə. Yumru gavalı. – Torbanı boşaldanda içindən kağıza bükülmüş bir yumru şey çıxdı.* S.S.Axundov.

2. *sif.* Dairəvi şəkildə olan; girdə. *Nizami özünü düzəltdi, xırda və yumru gözlərinin qapaqlarını qaldırdı.* M.S.Ordubadi. *Rəhimlinin qıyıq gözlərindən silinməyən təbəssüm qızartısı çəkilməyən, yumru, ətli, tüksüz sifətinə yaraşıq verirdi.* İ.Hüseynov.

3. *sif.* Gombul, koppuş, kök. *Yumru, totuq uşaqlar qızıl taxtlarda qumaş yastıqlara söykənən möminlərə şərab paylayırdılar.* Çəmənzəminli.

4. *is.* Tikə, dənə. [Şamama Cadu:] *Di, başına dönüm, bircə yumru mənə qənd ver.* Ə.Haqverdiyev. // *is.* Baş, kök yumrusu. *Cinsi*

*hüceyrələr iştirak etmədiyi bir halda da kartof yumrularında baş verən dəyişmələr ondakı gözcüklərə təsir edir.* M.Axundov.

**yumru-yumru** *zərf* və *sif.* Yumru (çox şey haqqında). *Yumru-yumru eləmək.* – [Əmiraslan baba dedi:] *Çərçinin saqqızdan savayı yumru-yumru sabunları, .. dəyirmi güzgüləri də olardı.* S.Rəhimov.

**YUMRUCA** *sif.* Yumru. *Yumruca bir uşaq.*

**YUMRUCUQ** *sif.* Azacıq yumru.

**YUMRUDİB** *sif.* Dibi yumru olan.

**YUMRUQ** *is.* 1. Yumulmuş əl, əlin yumulmuş vəziyyəti. *Başımı aşağı dikib durduğum halda, əlimdəki çörək qismətini yumruğumda saxlamağa başladım.* A.Divanbəyoğlu. *Uşaq da bu hay-küyün onunçun olduğunu duyur, balaca yumruğunu gözünə basıb ağlayırdı.* Mir Cəlal. *Mahmud .. yumruğu ilə kirpiyini sildi.* Ə.Əbülhəsən. [Otaqda] *ağzından yumruq irilikdə paslı qıfil asılmış sandıq .. vardı.* İ.Hüseynov. □ **Yumruğunu düyünləmək** – əlini yumruq halına salmaq.

2. Bu vəziyyətdə olan əl ilə vurulan zərbə. *Min acizü biçarələrin başın əzərdim; Sillə, yumruğnan.* M.Ə.Sabir. *Seyid yenə başladı təpəsinə yumruq endirməyə.* Ə.Haqverdiyev. *Bir də xanın yumruğunun zərbindən pəncərə çilik-çilik olub yerə səpildi.* Çəmənzəminli. □ **Yumruğa çıxmaq** – yumruq davasına çıxmaq, bir-birini yumruqlamaq. *Odunu olmasa hər kimsənin qış fəsli; Ağlaşar tifl, çıxar yumruğa arvad ər ilən.* Molla İsmayıl. ...**yumruğu altında olmaq** – ...itaətində olmaq, ... zülmü altında olmaq, daim ... zülmünü görmək. **Yumruq yemək** – döyülmək, yumruqla vurulmaq.

**YUMRUQLAMA** "Yumruqlamaq"dan *f.is.*

**YUMRUQLAMAQ** *f.* 1. Əlini yumulmuş vəziyyətə salmaq. *Solmaz əllərini yumruqlayıb balınca dayadı, ancaq qalxa bilmədi.* S.Rəhimov.

2. Yumruqla vurmaq (döymək). // Yumruqla taqqıldatmaq (döymək, döyəcləmək). [Müəllimə] *bir şey lazım olduqda, öz otağı ilə Tellinin sakin olduğu otaq arasındakı divarı yumruqlardı.* S.Hüseyn. // *məc.* Döyəcləmək. [Qəhrəman:] *Kənarda şiddətlə əsən qış ruzgarı birqat pəncərələri yumruqlayır, kiçik qar və buz zərrələri ilə bombardman edirdi.* H.Nəzərli.

**YUMRUQLANMA** "Yumruqlanmaq"dan *f.is.*

**YUMRUQLANMAQ** *məch.* Yumruqla vurulmaq (döyülmək), yumruq zərbəsi yemək.

**YUMRUQLAŞMA** "Yumruqlaşmaq"dan *f.is. Yumruq davası.*

**YUMRUQLAŞMAQ** *qarş.* Bir-birini yumruqla vurmaq, yumruqla vuruşmaq, yumruq davasına çıxmaq. *Ey mənim ruhani qardaşlarım. İndi eşidirəm ki, .. bir-biriniz ilə əlbəyaxa olub yumruqlaşanda əmmaməniz çaya düşüb.* C.Məmmədquluzadə.

**YUMRUQLATMA** "Yumruqlatmaq"dan *f.is.*

**YUMRUQLATMAQ** *icb.* Yumruqla döydürmək, yumruq vurdurmaq.

**YUMRULAMA** "Yumrulamaq"dan *f.is.*

**YUMRULAMAQ** *f.* Yumru şəklə salmaq, yumru etmək; dəyirmiləşdirmək.

**YUMRULANMA** "Yumrulanmaq"dan *f.is.*

**YUMRULANMAQ** *f.* 1. Yumru olmaq, yumru hala gəlmək; dəyirmilənmək, girdələnmək.

2. *məc.* Kökəlmək.

**YUMRULAŞMA** "Yumrulaşmaq"dan *f.is.*

**YUMRULAŞMAQ** *f.* 1. Getdikcə yumru şəkil almaq, yumru olmaq.

2. *məc.* Getdikcə yumru olmaq; kökəlmək.

**YUMRULATMA** "Yumrulatmaq"dan *f.is.*

**YUMRULATMAQ** *f.* Yumru hala salmaq; dəyirmiləşdirmək, girdələndirmək.

**YUMRULMA** "Yumrulmaq"dan *f.is.*

**YUMRULMAQ** *f. köhn.* Şişib ur kimi olmaq. ◊ **Yolu(n) yumrulsun, yolu yumrulmuş** – b a x **yol**.

**YUMRULU** *sif.* Yumrusu olan.

**YUMRULUQ** *is.* 1. Yumru şeyin halı; dəyirmilik, girdəlik. *Topun yumruluğu.*

2. *məc.* Köklük, koppuşluq.

**YUMRUSİFƏT** *sif.* Sifəti yumru və kök olan; girdəsifət. *Yumrusifət uşaq.* – *Kamerada iki nəfər də vardı. Biri qalınqaşlı, yumrusifət oğlandı.* Mir Cəlal.

**YUMRUYANAQ** *sif.* Yanaqları yumru və kök. *Teybə .. yumruyanaq, qırmızısifət, düzqamətli, dolğunəndamlı, ucaboy, zəhmli baxışları ilə nə isə daima qorxu təlqin edən bir qadındı.* M.Hüseyn.

**YUMŞACIQ** "Yumşaq"dan *oxş. Yumşacıq uşaq əlləri.*

**YUMŞAQ** *sif.* 1. Basdıqda, toxunduqda müqavimət etməyən və batıb qalmayan; qatı, sərt olmayan. *Yumşaq döşək. Yumşaq yastıq. – Bayram yumşaq kresloda oturub papağını çıxartdı, yaylıqla alnının tərini sildi.* M.Hüseyn. *Sadıq kişi ayağındakı yumşaq məs, şalvarı dolaqla qıvraq bağlanmış halda oğlunun dalınca gedirdi.* Mir Cəlal. // Sümüksüz. *Yumşaq ət.* ☐ **Yumşaq vaqon** – oturmaq və yatmaq üçün yumşaq yerləri olan sərnişin vaqonu. *Biletlər yumşaq vaqona alınmışdı.* M.S.Ordubadi. *Qarı daima beş nömrəli yumşaq vaqona minərdi*. Ə.Əbülhəsən. // Zərif, sərt olmayan, toxunduqda xoş hiss oyadan. *İpək kimi yumşaq. Yumşaq əl. Yumşaq parça. Yumşaq saç.* // Hələ quruyub sərtləşməmiş. *Mağaranın içi yumşaq ağac qabıqları ilə döşənmişdi.* A.Şaiq. *Kəhər hələ kifayət qədər qurumamış yumşaq otu böyründən söküb yeyirdi*. M.İbrahimov.

2. Bayat olmayan, təzə. *Yumşaq çörək. Yumşaq qoğal.*

3. Sıxanda asanlıqla yığıla bilən, basıla bilən, formasını dəyişə bilən, bərk olmayan. *Yumşaq mum. Yumşaq palçıq. Yumşaq xəmir.* // Asanlıqla işlənilə bilən, istənilən şəklə salına bilən. *Yumşaq materiallar. Yumşaq ağac. Bakı daşı çox yumşaq daşdır.*

4. Gözü, qulağı oxşayan, ruhu oxşayan, xoşagələn; kəskin olmayan, məlahətli. *Yumşaq səs. Musiqinin yumşaq ahəngi. Yumşaq tonlar. – Onun çox yumşaq və mülayim səsi vardı.* Ə.Vəliyev. // Mülayim, xoş; nə isti, nə soyuq. *Yumşaq hava. Yumşaq iqlim. Yumşaq yel.*

5. Xasiyyətcə həlim, mülayim. *Yumşaq xasiyyət. Təbiətcə yumşaq adamdır.* – [Mustafa bəy:] *Nə qədər ki sən bu kəndə gəlməmişdin, camaat bundan yumşaq idi.* Ə.Haqverdiyev. [Əsmərin] *Təbiəti olduqca yumşaq idi.* S.Hüseyn. *Ancaq hər ikisinin yumşaq təbiəti onları sabahı günü rast gəldikləri zaman dayanıb söhbət etməyə məcbur etmişdi*. S.Rəhman. ☐ **Yumşaq danışmaq** – mülayim danışmaq, mülayim rəftar etmək, sərtlik göstərməmək. [İbrahim bəy:] *A kişi, çəkil kənara, görüm a! Səninlə yumşaq danışdıqca azırsan.* Ə.Haqverdiyev.

6. *məc.* Yüngül, zəif, sərt olmayan. *Yumşaq hökm. Yumşaq rəftar. Yumşaq cəza.* // *məc.* Kəskin olmayan; nəzakətli, xoş. *Yumşaq ifadə. Yumşaq ton. Yumşaq söz.*

◊ **Yumşaq su** – tərkibində kirəc duzları az olan və sabunu asanlıqla əridən su.

**yumşaq-yumşaq** *zərf* Xoş dillə, yumşaqlıqla, mülayimcə, üsulluca. *Arvad qızını yanına çağırıb ondan yumşaq-yumşaq xəbər almağa başladı: – Ay gözümün nuru, balam, nə olub sənə rəngin belə solmuşdur?* (Nağıl).

**YUMŞAQBƏDƏNLİLƏR** *cəm zool.* Adətən daxili skeleti olmayan, üzəri çanaqla örtülü onurğasız heyvanlar tipi. *Dənizdə yaşayan yumşaqbədənlilər.*

**YUMŞAQCA** *zərf* və *sif.* Yumşaq, mülayim. *Yumşaqca cavab vermək. Yumşaqca bir şey.*

**YUMŞAQDƏRİLİ** *sif.* Dərisi yumşaq olan.

**YUMŞAQXASİYYƏT(Lİ)** *sif.* Xasiyyətcə, təbiətcə yumşaq, mülayim. *Yumşaqxasiyyət*(*li*) *adam.*

**YUMŞAQXASİYYƏTLİLİK** *is.* Yumşaqxasiyyət adamın hal və keyfiyyəti; xasiyyətcə, təbiətcə yumşaqlıq, mülayimlik.

**YUMŞAQLIQ** *is.* 1. Yumşaq şeyin hal və keyfiyyəti. *Döşəyin yumşaqlığı. Saçın yumşaqlığı. Yunun yumşaqlığı.*

2. Mülayimlik. *Xasiyyətin yumşaqlığı. Havanın yumşaqlığı.*

3. **Yumşaqlıqla** şəklində *zərf* – b a x **yumşaq-yumşaq**. [Məmmədhəsən əmi] *yovuğa yeriyib başladı yumşaqlıqnan oğlunu sakit etməyə..* C.Məmmədquluzadə. [Mehriban] *yumşaqlıqla cavab verdi..* S.Hüseyn.

**YUMŞAQTÜK(LÜ)** *sif.* Tükü (saçı) yumşaq (zərif) olan.

**YUMŞAQÜRƏKLİ** *sif.* Qəlbiyumşaq, ürəyiyumşaq; şəfqətli, rəhmdil.

**YUMŞAQÜRƏKLİLİK** *is.* Qəlbiyumşaqlıq, rəhmdillik, şəfqətlilik, şəfqət.

**YUMŞAQVARİ** *sif.* Bir qədər yumşaq, yumşaq kimi.

**YUMŞAQYARPAQLI** *sif.* Yarpaqları sərt olmayan, yarpaqları yumşaq olan. *Yumşaqyarpaqlı bitkilər.*

**YUMŞAQYUNLU** *sif.* Yunu yumşaq olan. *Yumşaqyunlu qoyun.*

**YUMŞALDICI** *sif.* 1. Yumşaldan, yumşaq hala sala bilən. *Yumşaldıcı maddələr*.

2. Yüngülləşdirici, sərtliyini, şiddətini azaldıcı. *Hökmü yumşaldıcı keyfiyyətlər. Təqsiri yumşaldıcı səbəblər*.

**YUMŞALDILMA** "Yumşaldılmaq"dan *f.is. Torpağın yumşaldılması.*

**YUMŞALDILMAQ** *məch.* Yumşaq hala salınmaq.

**YUMŞALMA** "Yumşalmaq"dan *f.is.*

**YUMŞALMAQ** *f.* 1. Yumşaq, elastik hala gəlmək; sərtliyini, bərkliyini, codluğunu itirmək. *Dəri suda yumşalmışdır.*

2. Zəifləmək, azalmaq, kəskinliyi, şiddəti keçmək. *Ağrı bir qədər yumşaldı.*

3. Mülayimləşmək; hirsi, acığı, qəzəbi, hiddəti keçmək, hirsi soyumaq. *Bir az yumşalmaq lazımdır. – Molla Qasım pulun adını eşitcək yumşalıb dedi: – Razı oluram.* S.S.Axundov. *Rüstəm bəy yumşaldı və Cəfərə baxaraq bir az da gülümsündü.* Çəmənzəminli. *Yumşalmadı daşa dönmüş ürəklər; Onlara göz yaşı etmədi əsər*. H.K.Sanılı.

**YUMŞALTDIRMA** "Yumşaltdırmaq"dan *f.is.*

**YUMŞALTDIRMAQ** *icb*. Başqası vasitəsilə yumşaltmaq. *Palçığı bir az yumşaltdırmaq lazımdır.*

**YUMŞALTMA** "Yumşaltmaq"dan *f.is.*

**YUMŞALTMAQ** *f.* 1. Yumşaq, elastik hala salmaq; sərtliyini, bərkliyini rəf etmək. *Torpağı yumşaltmaq. Yunu yumşaltmaq. Dərini suya qoyub yumşaltmaq. Dəmiri odsuz yumşaltmaq olmaz. – Qızlar təkcə kətmənlə torpaq yumşaltmırdılar.* Ə.Vəliyev.

2. Sərtliyini, hiddətini, inadını azaltmaq, yola gətirmək, razı etməyə çalışmaq. *Ürəyini yumşaltmaq. Həyat onun xasiyyətini xeyli yumşaltmışdı. Nə qədər çalışdıqsa, onu yumşalda bilmədik.* – [Naşad] [Mehribanı] *yumşaltmaq məqsədi ilə mülayim bir tərzdə dedi..* S.Hüseyn. *Günlər gəlib keçər, aylar adlar, Əfruz bacı Mədətin qılığına girər, onu yumşaltmağa çalışardı.* S.Rəhimov. *Sadıq onu yumşaltdı: – Ay arvad, səni çöldən tapmamışam, hara keyfindir, aparım.* Mir Cəlal. // Hirsini soyutmaq, rəhmə gətirmək. *..Gülyaz qocanı dilə tutub yumşaltmaq, onun hirsini soyudub öz istəkli qızını bu ağır xəstəlik yatağından qaldırmaq istəyirdi*. S.Rəhimov. // Kəskinliyini azaltmaq; mülayimləşdirmək. *Tonunu bir qədər yumşaltmaq*. // Bir qədər rahatlaşdırmaq, ağrısını, şiddətini azaltmaq, rahatlıq hissi oyatmaq. ☐ **Sinəsini yumşaltmaq** – öskürəyi azaltmaq, ciyərlərə yaxşı təsir göstərmək (dərman haqqında).

**YUMUQ** *sif.* Yumulmuş vəziyyətdə olan, örtülü, qapalı. *Yumuq gözlərini aç da, bir oyan; İndi zaman başqa zamandır, ana!* S.Vurğun.

**YUMULMA** "Yumulmaq"dan *f.is.*

**YUMULMAQ** *f.* Öz-özünə qapanmaq; örtülmək. *Mayilin gözləri ehmal-ehmal yumuldu.* Mir Cəlal.

**YUMULU** *sif.* Yumulmuş vəziyyətdə olan; örtülü, qapalı, yumuq. – *Vida deyəcəyəm Vətən mülkünə; Gözləri yumulu, əlləri açıq.* M.Araz.

**YUMURLAMA** "Yumurlamaq"dan *f.is.*

**YUMURLAMAQ** b a x **yumrulamaq**.

**YUMURLANMA** "Yumurlanmaq"dan *f.is.*

**YUMURLANMAQ** b a x **yumrulanmaq**. *Toğluların quyruğu yumrulanmış, yanları sığallanıb ət bağlamışdı.* M.İbrahimov.

**YUMURTA** *is.* 1. *biol.* İnsan və heyvan orqanizmlərinin yeni orqanizm vücuda gətirə bilən qadın cinsi hüceyrəsi (toxumu).

2. Quşların, tısbağaların və s. yumurtlayan heyvanların qabıqla örtülü belə hüceyrəsi. *Toyuq yumurtası. Ördək yumurtası. – Qonşudan bir gün ol rəşid cavan; Bir yumurta oğurladı pünhan.* S.Ə.Şirvani. [Dursun:] *Kim mənə yumurta versə, ona qurban olaram.* C.Cabbarlı. ☐ **Yumurta ağı** – quş yumurtasının sarı hissəsini dövrələyən şəffaf hissəsi. **Yumurta sarısı** – quş yumurtasının qatı sarı maddədən ibarət olan orta hissəsi.

3. Toxum.

◊ **Yumurtadan yun qırxmaq** – hər bir şeydən qazanc götürməyə çalışmaq. *Kişi gərək yumurtadan yun qırxsın, qəpik-qəpik toplasın, düşəndə işini yeritmək üçün ovuc-ovuc xərcləsin*. S.Rəhimov. **Qızıl yumurta bayramı** – b a x **qızıl**.

**YUMURTACIQ** *is.* 1. Balaca yumurta.

2. *biol.* Spermatozoid hasil edən kişi tənasül vəzisi, habelə insanda və məməli heyvanlarda daxili sekresiya orqanlarından biri.

3. *bot.* Toxumcuq. *Yumurtalıq yuvalarında yumurtalığın necə yerləşməsinin də böyük əhəmiyyəti vardır.*

**YUMURTALI** *sif.* 1. Yumurtası olan. *Yumurtalı toyuq qırtıldayır*.

2. Tərkibində yumurta olan, yumurta qatılmış. *Yumurtalı xörək. Yumurtalı xəmir.*

*– Yumurtalı çörək, ədvəli küftə; Gətirib gəlmişlər birinci həftə.* H.K.Sanılı.

**YUMURTALIQ** 1. *is.* Qadın cinsiyyət vəzisi.

2. *sif.* Yumurta vermək üçün yetişdirilən. *Yumurtalıq toyuqlar.*

3. *bot.* Çiçəkdə dişiciyin tozlanmadan sonra toxum əmələ gətirən aşağı hissə; toxumluq.

**YUMURTASIZ** *sif.* 1. Yumurtası olmayan, yumurta verməyən.

2. Tərkibində yumurta olmayan, yumurta vurulmamış. *Yumurtasız yeməklər.*

**YUMURTASIZLIQ** *is.* 1. Yumurta verməmə, yumurta çıxarmama, yumurtası olmama. *Yumurtasız toyuq.*

2. Tərkibində yumurta olmama, yumurta vurulmama.

**YUMURTAŞƏKİLLİ** b a x **yumurtavari**.

**YUMURTAVARİ** *sif.* Yumurtaya oxşar, yumurta şəklində olan, görünüşcə yumurtaya oxşayan; yumurtaşəkilli.

**YUMURTLAMA** "Yumurtlamaq"dan *f.is.*

**YUMURTLAMAQ** *f.* 1. Yumurta vermək, yumurta çıxarmaq. *Toyuqlar yumurtlayır. – Yumurtlamadığı bəs deyil, falı da içir.* (Ata. sözü).

2. *məc*. Gözlənilmədən və bəlli olmadan ortaya çıxarmaq (çıxmaq), meydana gətirmək (gəlmək). *Bu, haradan yumurtladı?*

**YUMURTLATMAQ** *icb*. Yumurtlamağa məcbur etmək, yumurtlaması üçün şərait yaratmaq. *Toyuğu falsız yumurtlatmaq çətindir.*

**YUN** *is.* 1. Bəzi məməli heyvanların dərisinin üstünü örtən tüklər. *Yun qırxımı. Qoyunların yununu vaxtında qırxmaq.*

2. Heyvandan (adətən qoyundan, dəvədən və s.) qırxılan belə tüklər. *Qoyun yunu. Dəvə yunu. Keçinin yununu qırxmaq. Yun darağı.* – [Şah:] *Sən bazardan mənə yun al və keçəçi aləti al.* Ü.Hacıbəyov. // Belə tükdən toxunmuş. *Yun parça. Yun əlcək. Yun ip. Yun köynək. – Telli özünə toxuduğu yun corabı aldı*. S.Hüseyn. *Pərşan gəlib yaxınlaşırdı, onun əynində xəzli qara palto, başında sarı yun şal, ayağında işıldayan uzunboğaz botı vardı*. M.İbrahimov.

◊ **Yun kimi** *məc.* – ağarmış və ya bozarmış saç-saqqal haqqında. *Ömür ötüb, baş ağarıb un kimi; Diş tökülüb, saqqal olub yun kimi*. M.Ə.Sabir.

**YUNAN** *is.* Yunanıstanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam. *Yunan dili. Qədim yunan mədəniyyəti. – Qədim vaxtlarda komediyanı yunanlar gülüş üçün çıxarırdılar..* N.Nərimanov.

**YUNANCA** *zərf* və *sif.* Yunan dilində. *Yunanca danışmaq. Yunancadan tərcümə. Yunanca-rusca lüğət.*

**YUNANİ** *köhn.* b a x **yunan**.

**YUNANLI** *is.* və *sif. köhn.* Yunan, yunanıstanlı. *Yunanlıların qədim mədəniyyəti. Yunanlı qadınlar. – Görünür ki, yunanlı saymış səni əjdaha; Bir dəfə baxıb getmiş, gəlməmişdir bir daha.* Ə.Cavad.

**YUNÇU** *is.* Yun mütəxəssisi, yaxud yun tədarükü, yun işləri ilə məşğul olan adam.

**YUNÇULUQ** *is.* Kənd təsərrüfatının, yunverən qoyun cinsləri yetişdirib artırmaqla məşğul olan sahəsi. *Yunçuluq təsərrüfatı.*

**YUNDARAĞI** *is.* Yun təmizləmək üçün dəmir dişlərdən ibarət alət.

**YUNDARAYAN** 1. *is.* Daraqla yun təmizləyən işçi və ya alət.

2. *sif.* Yun təmizləyən (darayan). *Yundarayan alətlər*.

**YUNDİDƏN** *sif.* Yunu didib təmizləyən. *Yundidən maşın.*

**YUNƏYİRƏN** *sif.* Yunu əyirib ip istehsal edən. *Yunəyirən fabrik*.

**YÚNKER** [*alm.* Junker] 1. *tar.* Keçmişdə Prussiyada: iri torpaq sahibi; zadəgan, mülkədar.

2. Çar Rusiyasında: zabit hazırlayan hərbi məktəb müdavimi. *Səhər səhərdir, axşam axşam – dünyanın hər yerində; yunkerlərin kölgəsi; cani kimi dolaşmasa; Madrid küçələrində.* R.Rza.

**YUNKERLİK** *is.* 1. *tar.* Yunkerlər. *Prussiya yunkerliyi.*

2. Yunker rütbəsi, adı.

**YUNQA** *is.* [*rus.*] Matros olmağa hazırlanan uşaq.

**YUNLAMA** "Yunlamaq"dan *f.is.*

**YUNLAMAQ** *f.* İçərisinə yun qoymaq, yunla doldurmaq.

**YUNLANMA** "Yunlanmaq"dan *f.is.*

**YUNLANMAQ** *qayıd*. Yunla örtülmək, üstünü yun basmaq.

**YUNLU** *sif.* 1. Üstündə yunu olan, qalın yunla örtülmüş, yun basmış. *Yunlu qoyun*.

2. İçərisində yun olan, isti olmaq üçün içərisinə yun qoyulmuş. *Yunlu palto. Yunlu gödəkcə. – Yunlu və qalın kürklərin yan ciblərindən qovurğa çıxarıb yeyən əsgərlərin bəziləri qarın üstündə oturmuşdu.* Ə.Vəliyev.

**YUNLUQ** *sif.* Çox yun verən, yun vermək üçün yetişdirilən. *Yunluq qoyun cinsləri. Merinos yunluq qoyundur.*

**YUNLULUQ** *is.* Heyvanın yunla örtülmə dərəcəsi, yunvermə qabiliyyəti.

**YUNSUZ** *sif.* 1. Üstündə yun olmayan və ya çox az olan, yun verməyən. *Yunsuz qoyun.*

2. İsti olmayan, isti olmaq üçün içərisinə yun qoyulmamış. *Yunsuz palto.*

**YUNVERƏN** b a x **yunluq**. *Yunverən qoyun cinsi.*

**YUNYUYAN** *sif.* Yunu yumağa məxsus. *Yunyuyan maşın.*

**YUPİTER** [*lat.* Jupiter] 1. Günəş sisteminin ən böyük planeti.

2. Kinotexnikada işlənən çox qüvvətli işıq verən elektrik cihazı; projektor.

**YUPYUMRU** *sif.* Tamamilə yumru; gipgirdə. *Yupyumru top kimi. – Düz yeri bir yupyumru şey qanır; Həm də deyir: sutkada bir firlanır.* M.Ə.Sabir.

**YÚRA** [*coğrafi addan*] **Yura dövrü**, **Yura sistemi** *geol.* – Yerin tarixində mezozoy erasının sıra ilə ikinci dövrü.

**YURD** *is.* 1. İnsanın doğulub böyüdüyü yer, məmləkət, ölkə; vətən. *Ey kiçik dəmirçi, duyduğun haqdır; Çalış, yurdun üçün özünü göstər.* Ə.Cavad. *Həyatımda safalı bir bağ salacağam mən; Yurdumda bir misilsiz bağban olacağam mən.* M.Müşfiq. *Hər məktubun öz dili var; Təravəti, istisi var; Çox məktubun sözlərində; Doğma yurdun tüstüsü var.* R.Rza. *Onlar yeni bir ilham və inam ilə xaraba qalmış yurdlarını abad etməyə başladılar.* Ə.Məmmədxanlı.

2. Yaşayış yeri, ev, ev-eşik, məskən. *Yurdundan olmaq* (*ev-eşiyindən, yaşadığı yerindən məhrum olmaq, avara düşmək*). ☐ **Yurd salmaq** – oturmaq, sakin olmaq. *Deyirdilər ki, qədimdə* [bu kəndə] *daş qoyub yurd salan adamın gözəl bir qızı varmış.* İ.Hüseynov. // Yaşayış məntəqəsi; kənd, el, oba. *Biz düşən yurdun adı Qızılboğaz idi.* İ.Əfəndiyev.

3. Körpə evi, uşaq bağçası mənasında. *Səyyahlar fabriki gəzdilər. Burada körpə çocuqlar üçün yurdlar, dispanserlər, sənət məktəbləri .. gördülər.* Çəmənzəminli.

4. *məc.* Bir şeyin çox olduğu yer. *Qəhrəmanlar yurdu.*

◊ **Yurdda qalan** *məc.* – hamıdan geri qalan. [Badam xala:] *Yurdda qalan elə səninlə mən imişəm. Kursda arvad nə qədər...* Mir Cəlal.

**YURDDAŞ** *is.* Bir yurda mənsub olan adamlardan hər biri; həmvətən, həmyurd, vətəndaş. *Yurddaşlara müraciət. – Gecələr yatmadan əvvəl sor özündən ki: "Bu gün; Mən nə etdim məni yurddaş edən öz yurdum üçün?"* B.Vahabzadə.

**YURDDAŞLIQ** *is.* Bir yurda mənsub olma; həmvətənlik, vətəndaşlıq.

**YURDLAMA** "Yurdlamaq"dan *f.is.*

**YURDLAMAQ** *f.* Özünə yurd düzəltmək, yuva qurmaq. *Nə gördüm? Samanda o yurdlamışdır; Bir fındıq boydaca yumurtlamışdır.* S.Vurğun.

**YURDLU** *sif.* Yurdu olan.

**YURDSUZ** *sif.* Yurdu, evi, məskəni olmayan, evsiz-eşiksiz, ev-eşiyindən, yurdundan məhrum olmuş. *Hələ də gəlib-gedənə əl açan yetim uşaqlar və yurdsuz arvadların əlindən tərpənmək mümkün deyildi.* M.İbrahimov. // Vətənsiz. *Vətən! Qoynunda bəslənmiş əməllər, arzular, şəksiz; Vətənsiz, yurdsuz insanlar yaşar aləmdə məsləksiz.* S.Vurğun. *Xatmurani səltənəti çöküb yerə; Bir əbədi yırtıcılar, bir də dedi; Mütilərdir tarix boyu yurdsuz qalan.* M.Araz. // Sahibsiz, baxımsız, kimsəsiz; avara. [Firidun] *bazar və küçələri doldurmuş yurdsuz uşaqlara, səfil-sərgərdan bir halda hər gələnə əl açan qadın və qızlara baxırdı..* M.İbrahimov.

**YURDSUZ-YUVASIZ** *sif.* 1. Yurdu-yuvası olmayan, ev-eşiyi olmayan; sərsəri, sərgərdan. *Yurdsuz-yuvasız adam.*

2. Sahibsiz, baxımsız, kimsəsiz. [Məsmə:] *Şəhərdə nə çoxdu yurdsuz-yuvasız uşaq, üzünə baxan kimdi? Adını tutan, yaxına qoyan kimdi?* Mir Cəlal.

**YURDSUZLUQ** *is.* 1. Yurdu, evi olmama.

2. Sahibsizlik, baxımsızlıq, kimsəsizlik.

**YURD-YUVA** *is.* Ev-eşik, ev, məskən. [Murad] *Sarının qəlbini qırmaq, onu yurdu-yuvası dağılmış bir zavallı sifətində, boynubükülü görmək istəyirdi.* S.Hüseyn. ☐ **Yurd-**

**yuva salmaq** – yaşamaq üçün şərait yaratmaq, ev-eşik düzəltmək (özü üçün).

**YURD-YUVASIZ** *sif.* Yurd-yuvası olmayan, yaşamaq üçün müəyyən yeri olmayan; avara, sərgərdan. *Qaçağam mən yurdsuz-yuvasız; Dura bilməm heç davasız...* H.K.Sanılı.

**YURİDİ́K** *sif.* Hüquqa aid olan, hüquqi, hüquq nöqteyi-nəzərindən.

**YURİ́ST** [əsli *lat.* jurist] b a x **hüquqşünas**. *Çingiz təkidlə: – İki ilə qurtararsan. Nə var ki, yurist deyilsənmi?* Çəmənzəminli.

**YURİSTLİK** *is.* Yuristin (hüquqşünasın) işi, peşəsi, ixtisası. *Yuristlik etmək* (*hüquqşünaslıqla məşğul olmaq*).

**YURTAV** *zərf məh.* At yerişinin bir növü. *Gənclərdən biri soruşdu: – Salam əmi! Qulan nə cür yeriyəcək? Yorğa, yurtav, yoxsa qədəmyerişi.* Ə.Vəliyev.

**YUSİF** *is.* Dini əfsanələrə görə, gözəlliyi ilə məşhur bir şəxs (Yaqub peyğəmbərin övladlarından biri) olub, klassik ədəbiyyatda gözəl (kişi) mənasında işlənmişdir (bəzən "Yusifi-Kənan" tərkibi şəklində işlənmişdir). *Elim, günüm, obam, misli-Züleyxam; Yusifi-Kənanım nəçün gəlmədi?* M.P.Vaqif.

**YUVA** *is.* 1. Quşların yumurtlayıb bala çıxarmaq və onları saxlayıb böyütmək üçün çör-çöpdən və s.-dən düzəltdikləri yer. *Qaranquş yuvası. Sərçə yuvası. – Quşlar yuvalarında oturub, dimdiklərini təmizləyirdilər*. N.Nərimanov. // Arı şanı. *Yuvadan aralanıb tək qalan arılar boğuq səslə həyətdə cövlan vurub pətəyi axtarırdılar*. Mir Cəlal. // Heyvanların düzəltdikləri yer, məskən. *Siçan yuvası. İlan yuvası. Ayı yuvası.*

2. *məc.* Ev, məskən, ev-ocaq mənasında. *Yuvası dağılmaq. İsti yuvasından məhrum olmaq. – Zəhra yuvası dağılmış bu yavrucuqların, analarını itirmiş bu üç qızın halını, ürək parçalayan səmimi göz yaşlarını görərək ixtiyarsız gözləri yaşardı*. S.Hüseyn. ☐ **Yuva salmaq** – 1) yurd salmaq, məskən salmaq, yaşamaq üçün şərait yaratmaq; özünə yer düzəltmək. *Üç dəfə qaçmışam qarlı Sibirdən; Bizim meşələrdə salmışam yuva*. S.Vurğun. [Əbdək:] *Dağlarda, daşlarda yuva salmış zavallı vətəndaşlarımın dərdi məni bir an belə rahat buraxmır..* M.Hüseyn; 2) *məc.* Yer tutmaq, yaşamağa başlamaq. *Məni xilas etdin vaxtsız ölümdən; O gündən qəlbimdə yuva saldın sən.* S.Vurğun.

3. *xüs.* Maşın, alət, qapı, pəncərə, kilid kimi şeylərin hissələrinin girib işləməsinə və ya birləşməsinə məxsus oyuq, çuxur, dəlmə. *Rəzə yuvası*. // Bir şeyin içində yerləşmiş olduğu oyuq. *Diş yuvası.*

4. *məc.* Bir şeyin törədiyi, intişar etdiyi yer; mənbə. [Qətibə:] *Paytaxtımız isə hazırda fitnələr, iftira və böhtanlar yuvasıdır.* M.S.Ordubadi. // *məc.* Yurd, vətən mənasında. *Sən, ey igid mədən torpağından qüvvət alıb gülən diyar; İgid ərlər meydanısan, qəhrəmanlar yuvasısan.* S.Vurğun. // Xana-xana bölünmüş şəkildə olan şey. *Toxum şahmat üsulu ilə, yuvalarla iki və ya bir cərgədə əkilir.*

5. *məc.* Bir şeyin çox olduğu yer. *Oğru yuvası. Canilər yuvası.*

**YUVACIQ** "Yuva"dan *oxş.* və *kiç. Hey gedirəm durmadan; Bir yuvacıq qurmadan.* S.Vurğun.

**YUVAQ** *is. anat.* 1. Ciyər toxumasının əmələ gətirdiyi xırdaca qabarcıqlar.

2. Çənədə diş köklərinin yerləşdiyi oyuqlar.

**YUVAQLIQ** *is. anat.* Çənədə diş yuvaqlarının yerləşdiyi yer.

**YUVALAMA** "Yuvalamaq"dan *f.is.*

**YUVALAMAQ** *f.* Yuva tikmək, yuva salmaq, yuva düzəltmək. *Sərçə divar dəliklərində yuvalar.*

**YUVALANMA** "Yuvalanmaq"dan *f.is.*

**YUVALANMAQ** *qayıd.* Özünə yuva düzəltmək. *Başına dönməkdən əlmi götürrəm; Can mürğü zülfündə yuvalanıbdır.* M.P.Vaqif.

**YUVALI** *sif.* Yuvası olan. *Yuvalı quşlar.*

**YUVARLAQ** *sif.* 1. Girdə, dəyirmi, yumru. *Çayın vadisini uğultu bürümüşdü. Hirsli sular iri, qara, yuvarlaq daşları yumalaya-yumalaya gətirdikcə, bir-birinə toxunub şaqqıldayırdı.* İ.Şıxlı. // Dairə şəklində olan. *Yuvarlaq stol. Yuvarlaq güzgü.* – [Ayrım qızı] *..şişman qadın idi, kiçik qumral gözləri, ay kimi yuvarlaq üzü var idi.* A.Şaiq.

2. *riyaz.* Kəsr deyil, tam ədədlə göstərilən. *Yuvarlaq ədəd.*

**YUVARLAQLAMA** "Yuvarlaqlamaq"dan *f.is.*

**YUVARLAQLAMAQ** *f.* Yuvarlaq hala gətirmək, yuvarlaq şəklə salmaq, yuvarlaq etmək.

**YUVARLAQLIQ** *is.* Yuvarlaq şeyin halı; girdəlik, dəyirmilik.

**YUVARLAMA** "Yuvarlamaq"dan *f.is.*

**YUVARLAMAQ** *f.* 1. Yuvarlaq bir şeyi itələyib hərəkət etdirmək; gillətmək. *Topu yuvarlamaq. Daşları başıaşağı yuvarlamaq. Çarxı yuvarlayaraq gətirdi.*

2. Yuvarlaq hala salmaq, girdə və ya uzunsov, lülə şəkli vermək. *Qəzeti yuvarlamaq. – Həbləri yuvarlamaq və onlara hamar səth vermək üçün* [əl diyircəyindən] *istifadə edilir.* R.Əliyev.

3. *məc.* Sövq etmək, sürükləmək, aparmaq, aparıb çıxarmaq. *Uçuruma yuvarlamaq. Bataqlığa yuvarlamaq. – Dədə-babadan qalma bu vərdiş sizi olduqca qorxulu bir yola yuvarlaya bilər.* Ə.Vəliyev.

**YUVARLANMA** "Yuvarlanmaq"dan *f.is.*

**YUVARLANMAQ** *qayıd.* 1. Yuvarlana-yuvarlana düşmək, diyirlənə-diyirlənə getmək, gedib düşmək. *Gözəlin əlindən düşən fındıq stolun üstündən yerə yuvarlandı.* Ə.Vəliyev.

2. *məc.* Sürüklənmək. [Zeynal] *get-gedə məişət pozğunluğunun çirkabı içinə yuvarlanırdı.* S.Hüseyn.

3. Yuvarlaq hala gəlmək, yuvarlaq şəklə düşmək.

**YUVARLATMA** "Yuvarlatmaq"dan *f.is.*

**YUVARLATMAQ** *icb.* 1. Yuvarlanmağa məcbur etmək. *Sanki bir sel* [Səriyyə və uşaqlarını] *çalxalaya-çalxalaya gətirib hündür bir bənddən başıaşağı, dəyirman daşının altına yuvarlatdı.* M.İbrahimov.

2. Yuvarlaq hala salmaq.

**YUVASIZ** *sif.* 1. Yuvası olmayan. *Yuvasız quş.*

2. *məc.* Yurdsuz, mənzilsiz, evsiz-eşiksiz; avara, sərgərdan. ☐ **Yuvasız quş** – *məc.* yurdsuz, evsiz, sığınacaqsız adam haqqında. [Hindli qız:] *Yuvasız bir quşam, elindən ayrı; Dağından, daşından, selindən ayrı.* A.Şaiq.

**YUVENİL** *is.* [*lat.*] *coğr.* Dərinliklərdən ilk dəfə yer səthinə çıxan ərgin sular.

**YUYUCU¹** *sif. xüs.* Təmizləmək üçün bir şeyi yuyan. *Yuyucu cihaz.*

**YUYUCU²** *is.* Meyit yuyan adam. [Əbülfəz kişinin] *üst paltarlarını qəbirqazanlara, alt paltarlarını yuyucusuna verdilər.* Ə.Vəliyev. *Ağlayır yuyucu, ağlayır kəfən; Ağlayır oraya hər gəlib-gedən; Hamı vurulubdur sənə, ya Əli; Aləm qurban olsun sənə, ya Əli.* Şəhriyar.

**YUYUCULUQ** *is.* Yuyucunun işi, peşəsi (b a x **yuyucu²**). *Yuyuculuq etmək.*

**YUYULMA** "Yuyulmaq"dan *f.is.*

**YUYULMAQ** *məch.* 1. Su, sabun və s. ilə çirki, ləkəsi təmizlənmək. *Paltarlar yuyuldu. Pilləkənlər yuyuldu. Çirkli qablar yuyuldu. – Şərifə o gün yuyulan paltarlara ütü çəkməklə məşğuldu.* S.Hüseyn.

2. Axar suyun təsiri ilə pozulmaq, dağılmaq, yuyulub aparılmaq.

**YUYULMAMIŞ** *f.sif.* Su və ya su və sabun ilə təmizlənməmiş; kirli, çirkli. *Yuyulmamış qab. Yuyulmamış paltar. Yuyulmamış meyvə.* – [Məşədi:] *Allah kəssin müsəlmanın evini-eşiyini, dirliyini, səliqəsini! Gözəl xörəkləri ortalığa bir sifətdə çıxardırlar ki, adamın ürəyi ağzına gəlir... Qaşıqlar sınıq, iki ildən yuyulmamış əl dəsmalı...* Ə.Haqverdiyev.

◊ **Yuyulmamış qaşıq kimi özünü ortaya atmaq** – münasibətsiz, yersiz bir işə və ya söhbətə qarışmaq, ortalığa atılmaq. *Dildar yuyulmamış qaşıq kimi özünü ortaya atdı.* Ə.Vəliyev.

**YUYULMUŞ** "Yuyulmaq"dan *f.sif. Yuyulmuş paltar. Yuyulmuş qab. Yağışdan yuyulmuş asfalt. Dalğalardan yuyulmuş sahil. – ..Yağışdan yuyulmuş kərpiclərin sarı samanı biz-biz çıxmışdı.* İ.Hüseynov.

**YUYUNACAQ** *is.* Əlüzyuyan (cihaz). [Kəblə Rəcəb] *cəld gedib, yuyunacaqda əllərini sabunla yuyub suya çəkir.* Ə.Haqverdiyev.

**YUYUNDURMA** "Yuyundurmaq"dan *f.is.*

**YUYUNDURMAQ** *f.* Su, sabun və s. ilə əl-üzünü, bədənini yumaq; çimizdirmək. *Uşağı vannada yuyundurmaq.*

**YUYUNMA** "Yuyunmaq"dan *f.is.*

**YUYUNMAQ** *qayıd.* 1. Öz əl-üzünü, bədənini yumaq; çimmək. *Hamamda yuyunmaq. Çayda yuyunmaq. – Kərim xan gəlib yuyunar, çörək yeyər, çay içər və köhnə cırıq kilimin üstündəki mütəkkəyə söykənərək xəyala dalardı.* M.İbrahimov. *Qızlar quyunun başında yuyunurdular.* Ə.Vəliyev.

2. *məc.* İslanmaq, üzərinə şeh düşmək; nəmlənmək. *Al örpək örtdü bağçalar; Yuyundu şehlə gül-çiçək.* Ə.Cəmil.

**YUYUNTU** *is.* İçində paltar və s. yuyulmuş su; çirk su.

**YÜK** *is.* 1. Daşınmaq, aparılmaq üçün hər cür şey, daşınmalı olan mal və s. *Yükü boşaltmaq. Heyvanın dalına yük çatmaq. – Ağ dəvə düzdə qaldı; Yükü Təbrizdə qaldı; Oğlanı dərd apardı; Dərmanı qızda qaldı.* (Bayatı). ☐ **Yük heyvanı** – yük daşıyan heyvan. // İçində şey olan torba, kisə, yeşik və s. *Yükləri bir yerə yığmaq.* // Eyni mənada saylarla. [Heydər bəy:] *Heç kəs qorxudan gedib gətirə bilmir. Məgər handa bir rəşid və qoçaq adam cürət edib bir yük, iki yük çıxarda bilər.* M.F.Axundzadə. *O ki qaldı danışığımız, cümlətani bir yük buğda olmuşdur.* S.Rəhimov. // Ağır şey; ağırlıq. *Bu bir yükdür ki.* **Yük maşını** – ağır şeylər (yük) daşımaq üçün böyük avtomobil. *Bahadır çayçı dükanının qabağında bir-iki yük maşınına yaxınlaşdı.* S.Rəhman. **Yük vurmaq** – yük yükləmək. *Paroxoda yük vurmaq.*

2. Səliqə ilə üst-üstə yığılmış yorğan-döşək, xalça-palaz. *Bu zaman bir quş alaçığın ağzından ildırım kimi şığıyıb yükün altına soxuldu.* A.Şaiq. *Bütün avadanlıq evin yuxarı tərəfinə yığılıb, üstünə köhnə palaz çəkilmiş yoxsul bir yükdən ibarət idi.* İ.Əfəndiyev. // Yük yığılan, camaxatan. *Yorğan-döşək yükdədir. Yükdən bir yorğan götürdü. – Kilim, gəbə yükdədi; Gözlərim gədikdədi; Dönüb geri baxsana; Sevdiyin yar dikdədi.* (Bayatı). ☐ **Yük sandığı** – üzərinə yük yığmaq üçün iri sandıq. *İki dəst yorğan-döşək, nazbalış, iki yük sandığı, bir neçə mücrü, taxçalara qoyulası mücrülərin altına gümüşdən məmul zirəndazlar tədarük görüləcəkdir.* R.Əfəndiyev. **Yük yeri** – yük yığmaq üçün divarda açılan yer, şkaf.

3. *məc.* Ağır vəzifə, məsuliyyətli iş; məsuliyyət. *Mən bu yükü öhdəmə götürə bilmərəm. Bu yükün altından çıxmaq çətin olacaqdır. – Rüstəm kişi, doğrudan da, yükünün ağır olduğunu hiss etdi.* M.İbrahimov. // *məc.* Yorucu, əziyyətli, sıxıcı iş; qayğı, sıxıntı, ağırlıq. *Bu da bizə bir yük oldu. Bu yükün altından məni qurtar. – Gülsümün yükü və dərd-qəmi gündən-günə artmaqda idi.* Ə.Haqverdiyev.

4. *fiz.* Hər hansı bir cisimdə olan elektrikin miqdarı. *Müsbət yük.*

◊ **Yük etmək (eləmək)** – lazım olmayan, artıq bir şeyi özü ilə götürmək. [Bahar Gülpəridən soruşdu:] *Xanım, üç aydan ötrü bir belə şeyi yük eləyib aparmağın nə mənası var?* S.S.Axundov. **Yükünü tutmaq** – 1) hər cür lazımi şeylərlə (adətən qiymətli şeylərlə) özünü təmin etmək; mal-dövlət yığmaq. [Hacı Fərəc:] *Yusif səkkiz yaşındadır, gəlib yetişənədək mən yükümü tutaram.* N.Vəzirov; 2) *dan.* çox yemək, doymaq.

**YÜKALAN** *is.* Ünvanına qatar, gəmi, təyyarə və s. vasitəsilə yük göndərilən təşkilat, adam və s.

**YÜKALTI** *is.* Üstünə yük yığmaq üçün qurğu (b a x **yük** 2-ci mənada).

**YÜKBOŞALTMA** *is.* Yükü boşaltma işi.

**YÜKDAŞIYAN** *sif.* Yük daşımağa məxsus. *Yükdaşıyan maşın. Yükdaşıyan gəmi.* // Yük daşımaqla məşğul olan. *Yükdaşıyan fəhlə.* // *İs. mənasında.* Vağzalda sərnişinlərin şeylərini daşımaqla məşğul olan işçi. *Yükdaşıyan çamadanı yerə qoyanda Əziz əlini cibinə atdı.* S.Rəhimov.

**YÜKDAŞIMA** *is.* Yük daşıma işi.

**YÜKGÖNDƏRƏN** *is.* Birinin ünvanına qatar, gəmi, təyyarə və s. vasitəsilə yük göndərən təşkilat, adam və s.

**YÜKGÖTÜRMƏ** *is. tex.* Mexanizmlərin ağır şey qaldırma gücü.

**YÜKQALDIRAN** *sif.* Ağır şeyləri, yükləri qaldıran. *Yükqaldıran maşın. – Hündür və qüvvətli yükqaldıran kran uzun xortumunu dik tutaraq vüqarla durmuşdur.* Ə.Sadıq. // *İs. mənasında.* Ağır şeyləri qaldırmaq üçün işlədilən müxtəlif mexanizmlərin adı.

**YÜKLƏDİLMƏ** "Yüklədilmək"dən *f.is.*

**YÜKLƏDİLMƏK** *məch.* Başqasına yükləmə işi gördürmək.

**YÜKLƏMƏ** "Yükləmək"dən *f.is.*

**YÜKLƏMƏK** *f.* 1. Yük vurmaq, yük qoymaq, yüklə doldurmaq. *Vaqonu* (*gəmini, maşını*) *yükləmək. – Körpünün sol tərəfində dayanmış gəmiyə taxta-şalban yükləyirdilər.* M.Hüseyn. // Dalına yük vurmaq, yük çatmaq. *Atı yükləmək. Dəvəni yükləmək. –* [Molla] *səhər tezdən durub xiyarı dərir, eşşəyə yükləyib şəhərə tərəf yola düşür.* "M.N.lətif." *Mağıl keçən vaxtlar dəvə karvanları düzülürdü yola, ticarət malını yükləyirdik dəvələrə.* C.Məmmədquluzadə. // Aparmaq (daşımaq) üçün vermək. [Firidun bəy:] *Əlacım kəsildi, get-*

*dim,* [Anna Petrovna] *oradan bir neçə əski-üsgüdən alıb məni yüklədi.* Ə.Haqverdiyev.

2. *məc.* Üzərinə çox iş qoymaq, çox iş tapşırmaq, vəzifəsini, işini ağırlaşdırmaq. *Yazığı o qədər yükləyiblər ki, heç vaxtı qalmır.*

3. *xüs.* Elektrik enerjisi vermək (bir cismə, cihaza və s.-yə). *Batareyanı yükləmək. Akkumulyatoru yükləmək.*

**YÜKLƏNMƏ** "Yüklənmək"dən *f.is. Maşınların yüklənməsi.*

**YÜKLƏNMƏK** *məch.* 1. Yük vurulmaq, yük qoyulmaq, yüklə doldurulmaq. *Vaqonlar* (*maşınlar*) *yüklənmişdir.* // Dalına yük çatılmaq (qoyulmaq). *Heyvanlar yüklənmişdir.*

2. *qayıd.* Öz dalına yük qoymaq, yük çatmaq.

3. *xüs.* Elektrik enerjisi almaq. *Kondensator elektrik yükü ilə yüklənmişdir.*

**YÜKLƏNMİŞ** *f.sif.* Yük qoyulmuş, yük vurulmuş, yük doldurulmuş. *Yüklənmiş maşın. Taxıl ilə yüklənmiş vaqonlar.* // Arxasına yük çatılmış, yük qoyulmuş. *Yüklənmiş at.*

**YÜKLƏTMƏ** "Yüklətmək"dən *f.is.*

**YÜKLƏTMƏK** *icb.* Yükləmə işi gördürmək, yük vurdurmaq. *Arabaları yüklətmək.*

**YÜKLƏYİCİ** *sif.* Yükvuran, yükqaldıran, yükləyən. *Yükləyici maşın.*

**YÜKLÜ** *sif.* 1. Yük vurulmuş, yüklənmiş, yükü olan. *Yüklü vaqon. Yüklü maşın. Yüklü araba. – Kişi əlində çomaq; Sürür yüklü öküzü.* A.Səhhət.

2. Bir şeylə yüklənmiş, üzərində, əllərində və ya dalında bir şey olan. *Biləklər çirməkli, döşlər önlüklü; Hamısı torbalı, hamısı yüklü.* S.Vurğun.

**YÜKLÜK** *is.* Yük yığılan yer, yük yeri. *Otaqların müxəlləfatı yüklükdə bir dəst yorğan-döşək, .. çaxmaqlı tüfəng, köhnə xəncərdən ibarətdir.* A.Şaiq.

**YÜKSƏK** *sif.* 1. Uca, hündür. *Yüksək bina. Yüksək dağ. Yüksək ağac. Yüksək təpə. – Yolun üst tərəfində, yüksək qayaların döşündə şam ağacları görünürdü.* S.Şamilov. // Yüksəklərdə olan. *Yüksək yer. Yüksək yaylaqlar. Yüksəkdə uçan təyyarə.*

2. Adi səviyyədən yuxarı. *Suyun səviyyəsi hələ də yüksəkdir.*

3. Say, qüvvə, şiddət və s. cəhətdən böyük, çox güclü, çox artıq. *Yüksək əmək məhsuldarlığı. Yüksək məhsul. Yüksək sürət. Yüksək qiymət. Yüksək hərarət. Yüksək təzyiq. Yüksək gərginlik.* – [Müəllim] *intiqam hissinin yüksək və müqəddəsliyindən hərarətlə bəhs edirdi.* Ə.Sadıq.

4. Keyfiyyətcə yaxşı, əla. *Yüksək sənət nümunələri. Yüksək mədəniyyət. Yüksək ixtisas. Yüksək keyfiyyətli mal.*

5. Çox böyük əhəmiyyəti olan; ali, şərəfli, fəxri. *Yüksək mükafat. Ədəbiyyatın yüksək vəzifəsi.*

6. Dərin, qeyri-adi məzmunlu, böyük, ulu, ali. *Yüksək ideya. Yüksək ideal. Yüksək hisslər. Yüksək arzular. Yüksək mövzuda söhbət.*

7. Təmtəraqlı, təntənəli. *Yüksək üslub. Yüksək ifadələr.*

8. Çox nazik və uca. *Yüksək səs. Yüksək not.*

◊ **Yüksək fikirdə olmaq** – çox yaxşı fikirdə olmaq, yüksək qiymətləndirmək. *İşimiz haqqında yüksək fikirdədirlər.* **Yüksəkdə durmaq** – üstün olmaq, daha irəlidə olmaq. *Mən bu gün bir daha qadının incəsənət işlərində kişilərdən daha yüksəkdə durduğunu gözümlə gördüm.* M.S.Ordubadi. **Yüksəkdən baxmaq** – xor baxmaq, saymamaq, etina etməmək, bəyənməmək. **Yüksəyə qalxmaq** – ötüb keçmək, üstün olmaq. [Füzuli] "*Leyli və Məcnun*" *kimi dahiyanə əsərində öz qoca rəqiblərini geri buraxmış və hamısından yüksəyə qalxmışdır.* C.Cabbarlı.

**YÜKSƏKCƏ** *sif.* Bir qədər yüksək; yüksək. [Qızın] *yüksəkcə boyu, ağ bənizi, uzaqlarda bir şey arayan dalğın gözləri diqqətimi cəlb etmişdi.* S.Hüseyn. // Çox yüksək. *Yüksəkcə bir ağac. Yüksəkcə divar.*

**YÜKSƏKGƏRGİNLİKLİ** *sif. elektr.* Gərginlik dərəcəsi yüksək olan. *Yüksəkgərginlikli cərəyan.*

**YÜKSƏKİXTİSASLI** *sif.* Yüksək ixtisas sahibi olan. *Yüksəkixtisaslı kadrlar.*

**YÜKSƏKLİK** *is.* 1. Hündürlük, ucalıq; yüksək şeyin halı. *Dağın yüksəkliyi. Divarın yüksəkliyi. Evin yüksəkliyi iyirmi metrdir. Bu yüksəklikdə ağac görməmişəm.*

2. Yer səthindən yüksəkdə olan sahə, yer; dağlıq, təpəlik. *Yüksəklikdə bitən ağaclar. Yüksəklikdə yol salmaq.* – "*Güdəqala*" *deyilən yüksəklik üzərindəki ovdanların yanında idik.* S.Hüseyn.

3. Yer səthindən çox-çox yuxarı olan fəza; göy, asiman (çox zaman cəm şəklində). *Buludlar yüksəkliklərdə üzür. Təyyarə yüksəkliklərdə süzür. Yüksəkliklərdə ulduzlar sayrışır.*

4. Bir şeyin böyüklüyü, ölçüsü, səviyyəsi, dərəcəsi. *Təzyiqin yüksəkliyi. Hərarətin yüksəkliyi. Biliyin yüksəkliyi. Əmək məhsuldarlığının yüksəkliyi. Texnikanın yüksəkliyi.*

**YÜKSƏKLİKÖLÇƏN** *is. xüs.* Yüksəkliyi (yer səthi nöqtələrinin, uçucu aparatların uçuşunun və s.-nin ucalığını) ölçən müxtəlif cihaz və alətlərin ümumi adı.

**YÜKSƏKMAAŞLI** *sif.* Yüksək tariflər üzrə maaş (zəhmət haqqı) alan. *Yüksəkmaaşlı vəzifə.*

**YÜKSƏKMƏHSULLU** *sif.* Yüksək məhsul verən, bollu məhsul verən. *Yüksəkməhsullu heyvandarlıq. Yüksəkməhsullu mal-qara cinsləri. Yüksəkməhsullu bitkilər.*

**YÜKSƏKMOLEKULLU: yüksəkmolekullu birləşmələr** *fiz.* – molekulları zəncirlər şəklində qurulmuş maddələr.

**YÜKSƏKVƏZİFƏLİ** *sif.* Yüksək vəzifə sahibi olan, yüksək ictimai və ya xidməti mövqe tutan. *Yüksəkvəzifəli şəxslər.*

**YÜKSƏKVOLTLU** *sif. elektr.* Yüksək elektrik cərəyanına aid olan. *Yüksəkvoltlu cihazlar. Yüksəkvoltlu elektrik xətti.*

**YÜKSƏLDİLMƏ** "Yüksəldilmək"dən *f.is.* *Suyun səviyyəsinin yüksəldilməsi. Əmək məhsuldarlığının yüksəldilməsi.*

**YÜKSƏLDİLMƏK** *məch.* 1. Qaldırmaq, ucaldılmaq, daha yüksək, uca edilmək, hündürlüyü artırılmaq.

2. Artırılmaq, gücləndirilmək. // *məc.* Daha yüksək pilləyə qaldırılmaq, yaxşılaşdırılmaq, təkmilləşdirilmək.

**YÜKSƏLİŞ** *is.* 1. İnkişaf prosesində irəliyə, yaxşılaşmağa, mükəmməlləşməyə doğru hərəkət; yüksəlmə, irəliləmə, tərəqqi, inkişaf. *Dünyada hər könül yüksəliş arar; Varlığın nə ilki, nə axırı var.* S.Vurğun. *Biz yüksəliş dağını fəth edərək aşırıq; Cavanlaşır ölkəmiz, biz də cavanlaşırıq.* S.Rüstəm.

2. Artma, çoxalma, güclənmə, qüvvətlənmə.

**YÜKSƏLMƏ** "Yüksəlmək"dən *f.is.*

**YÜKSƏLMƏK** *f.* 1. Yüksəyə, yüksəklərə, yuxarı qalxmaq; ucalmaq. *Bina xeyli yüksəlmişdir. – Ay xeyli yüksəlmiş, ətrafı yarımkölgəli bir surətdə aydınlatmışdı.* S.Hüseyn. *Günəş bu yerlərdə qalxıb atına; Yüksəlir göylərin yeddi qatına.* S.Vurğun. *Günəş üfüqdən xeyli yüksəlmişdi.* İ.Əfəndiyev. // Üfüqdə görünmək, çıxmaq, tülu etmək, zahir olmaq. *Boz dağın arxasında doğan günəş saf mavi göydə yüksələrək günorta yerinə qalxmışdı.* Ə.Sadıq.

2. Artmaq, qalxmaq, çoxalmaq, səviyyəcə yuxarı qalxmaq. *Çayın suyu xeyli yüksəlmişdir. Havanın temperaturu birdən-birə yüksəldi.* // Artmaq, şiddətlənmək, güclənmək. *Xəstənin qızdırması yüksəldi. Məşğələlərə maraq xeyli yüksəlmişdir. Küləyin şiddəti getdikcə yüksəlir. Gəlir faizi gündən-günə yüksəlir. Yaxşı kitablara olan tələbat çox yüksəlmişdir.* // Yaxşılaşmaq. *Şagirdlərin dərs müvəffəqiyyəti getdikcə yüksəlir. Məhsulun keyfiyyəti yüksəlmişdir. Gənc rəssamların yaradıcılıq səviyyəsi yüksəlmişdir. Əhvali-ruhiyyəsi yüksəldi.*

3. Hörməti, nüfuzu, mövqeyi, qiyməti, dəyəri artmaq; tanınmaq, şöhrətlənmək. *Kollektivdə nüfuzu yüksəlmək. Bu hadisədən sonra o bizim gözümüzdə çox-çox yüksəldi. – Dedi: – Az-az görünməyim nədən sizə ağır gəlir? Dedim: – Çünki bu dünyada gözəlliklə söz yüksəlir.* S.Vurğun. // *məc.* Tərəqqi etmək, artmaq, inkişaf etmək. *Yüksəlmək haqqımdır, iradəm vardır; Biliyim, şüurum hər şey yaradır.* A.Şaiq.

4. Daha yüksək, daha məsul vəzifəyə keçmək, daha yüksək mövqe tutmaq. *Vəzifəcə yüksəlmək.*

5. Eşidilmək, gəlmək, qalxmaq (səs haqqında). *Ura sədaları göyə yüksəldi. Evdən dəhşətli bir fəryad yüksəldi. – Mənim də evimdən işıq gələrdi; Qapımdan, bacamdan səs yüksələrdi.* S.Vurğun.

6. Uzaqdan və ya yaxından görünmək (uca şey haqqında). *Çayın sahilində uca qayalar yüksəlir. Qəsəbənin ortasında mədəniyyət sarayının binası yüksəlir. – Kəndin aşağı tərəfində məktəb binası yüksəlir.* Ə.Vəliyev.

**YÜKSƏLTMƏ** "Yüksəltmək"dən *f.is.*

**YÜKSƏLTMƏK** *f.* 1. Qaldırmaq, ucaltmaq, daha uca etmək, hündürlüyünü artırmaq. *Divarı bir qədər yüksəltmək lazımdır. Suyun səviyyəsini yüksəltmək.*

2. Artırmaq, gücləndirmək. *İşin sürətini yüksəltmək. Əmək məhsuldarlığını yüksəltmək. Tələbi yüksəltmək.* // *məc*. Daha yüksək pilləyə qaldırmaq; yaxşılaşdırmaq, təkmilləşdirmək. *Xalqın rifah halını daha da yüksəltmək. Mədəniyyəti yüksəltmək. Biliyini yüksəltmək.*

3. *məc*. Rolunu, əhəmiyyətini, hörmətini daha da artırmaq. *Alicənab hərəkəti onu adamların gözündə daha da yüksəltdi.*

**YÜKSÜZ** *sif.* Yükü olmayan; boş. *Yüksüz maşın. Yüksüz qatar.* // *zərf* Heç bir yük götürmədən; boş. *Maşınlar yüksüz qayıtdılar.*

**YÜKVURMA** *is.* Yükləmə işi.

**YÜNGÜL** *sif.* 1. Çəkisi az olan (*ağır* ziddi). *Yüngül yük. Yüngül çamadan. Yüngül daş.* ☐ **Yüngül çəkmək** – çəkidə aldatmaq, əskik vermək. // Sıx olmayan, nazik. *Yüngül parça.* // İsti olmayan, qalın olmayan; qızdırmayan. *Yüngül paltar.* // Taxtadan tikilmiş. *Yüngül pavilyon. Yüngül bina.* // Həzmi asan olan, mədəyə ağırlıq verməyən. *Yüngül yeməklər. Yüngül qəlyanaltı. Axşam yeməyi yüngül* (z.) *olmalıdır*.

2. Çətin olmayan, asan olan. *Yüngül mətn. Yüngül məsələ.* // Aydın, sadə, səlis. *Yüngül üslub. Dili çox yüngüldür.* – [M.Ə.Sabir] *sadə və aydın bir dillə oynaq və yüngül misralarda böyük bir cəsarətlə köhnəliyi .. qamçılayırdı.* M.Arif. // Əyləndirici mahiyyətdə olan. *Yüngül musiqi. Yüngül komediya. Yüngül mahnı.* // Asanlıqla əldə edilən, qazanılan. *Yüngül qazanc. Yüngül qələbə.* // Yerinə yetirilməsi çətin olmayan, çox zəhmət tələb etməyən; asan. *Yüngül iş. Yüngül vəzifə.*

3. Ciddi olmayan; əhəmiyyətsiz, xətərsiz. *Yüngül yara. Yüngül xəstəlik.* // Əziyyətsiz, ağrısız. *Yüngül doğuş. Yüngül həyat.* // Ağır olmayan; şiddətsiz. *Yüngül cəza. – Fəxrəddin isə Qızıl Arslandan yüngül bir məzəmmət alandan sonra Hüsaməddini qaçıran qadını axtarmağa başladı.* M.S.Ordubadi.

4. Zəif, az (hiss edilən). *Yüngül külək. Yüngül qoxu. Yüngül təbəssüm. Üzündə yüngül kədər izləri göründü.* // Təsiri az olan, tünd olmayan; zəif, boş. *Yüngül şərab. Yüngül tütün.*

5. *məc.* Səthi, qeyri-ciddi. *İşə yüngül münasibət. Yüngül mühakimələr.* // Adam, hərəkət, xasiyyət haqqında. *Yüngül adam. Yüngül xasiyyət. Yüngül əxlaq. – Onu söyləməyə gəlmişəm sizə; Yüngül* (z.) *görünməyim gözlərinizə.* S.Vurğun.

6. *məc.* Sağlam, çevik, qıvraq. *Nəriman özünü rahat və yüngül* (z.) *hiss etdi.* Mir Cəlal. // Saf, təmiz, tənəffüsü asanlaşdıran. *Yüngül dağ havası. – Yüngül payız havası müalicəyə gəlmiş adamlara daha artıq ləzzət verirdi.* M.İbrahimov.

7. Ağır silahlanmamış; mütəhərrik. *Yüngül topçu dəstəsi. Yüngül batareya. Yüngül kreyser.*

◊ **Yüngül atletika** – atletikanın, qaçış, tullanma, nizə, disk və s. tullama növləri. **Yüngül ayaq** – b a x **ayağı yüngül** (“**ayaq**[1]”da). [Mirzəli:] *Doğrudan, Hümmətəli, sən elə yaxşısan, yüngül ayaqsan, gələsən, qaçıb bir xəbər gətirəsən.* C.Məmmədquluzadə. **Yüngül əl** – əli yüngüllük, şəfa, uğur, qazanc gətirən adam haqqında. **Yüngül kavaleriya** *tar.* – sovet idarələrinin işini yoxlamaq üçün vaxtilə komsomol tərəfindən təşkil edilən dəstələr, briqadalar və s. **Yüngül sənaye** – çoxişlənən mallar hazırlayan sənaye.

**YÜNGÜLCƏ** 1. *sif.* Bir qədər yüngül; yüngülvari, yüngültəhər. *Yüngülcə bir daş.* // Çox yüngül.

2. *zərf* Bir balaca, azacıq, ciddi olmayaraq. *Yüngülcə soyuqlamaq. Yüngülcə sancılanmaq. – Bülənd qolundan yüngülcə yaralanmışdır.* Ə.Əbülhəsən.

**YÜNGÜLÇƏKİLİ** *sif.* Çəkisi yüngül olan, çəkisi az olan, ağır olmayan.

**YÜNGÜLXASİYYƏT(Lİ)** b a x **yüngültəbiət(li)**.

**YÜNGÜLXASİYYƏTLİLİK** b a x **yüngültəbiətlilik**.

**YÜNGÜLLƏDİLMƏ** “Yüngüllədilmək”dən *f.is.*

**YÜNGÜLLƏDİLMƏK** *məch*. Yüngül hala salınmaq.

**YÜNGÜLLƏŞDİRİCİ** *sif.* 1. Yüngülləşdirən, ağırlığını azaldan. *Zəhməti yüngülləşdirici şərait.*

2. *hüq.* Yüngüllük verən, şiddətini, təsirini azaltmağa imkan verən. *Cəzanı yüngülləşdirici keyfiyyətlər.*

**YÜNGÜLLƏŞDİRİLMƏ** “Yüngülləşdirilmək”dən *f.is. Əmək şəraitinin yüngülləşdirilməsi.*

**YÜNGÜLLƏŞDİRİLMƏK** *məch.* 1. Ağırlığı, çəkisi azaldılmaq, daha yüngül edilmək.

2. Əziyyəti, çətinliyi, ağırlığı azaldılmaq; asanlaşdırılmaq. // Zəiflədilmək, yumşaldılmaq, azaldılmaq.

**YÜNGÜLLƏŞDİRMƏ** "Yüngülləşdirmək"-dən *f.is.*

**YÜNGÜLLƏŞDİRMƏK** *f.* 1. Zəhmətini, əziyyətini, çətinliyini, ağırlığını azaltmaq; asanlaşdırmaq. *Əmək şəraitini yüngülləşdirmək. Yolu yüngülləşdirmək. İşini yüngülləşdirmək. Vəziyyətini yüngülləşdirmək.*

2. Zəifləşdirmək, yumşaltmaq, azaltmaq. *Dərdini yüngülləşdirmək. Ağrını yüngülləşdirən dərmanlar. – Prokuror da, vəkil də dönə-dönə inad edirdilər ki, doğrusunu aç söylə,* [məhkəmə] *sənin təqsirini yüngülləşdirər*. Mir Cəlal.

3. Təskin etmək, yumşaltmaq. *Ürəyini yüngülləşdirmək.*

4. Quruluşunu sadələşdirmək, bəsitləşdirmək. *Maşının quruluşunu yüngülləşdirmək.*

**YÜNGÜLLƏŞMƏ** "Yüngülləşmək"dən *f.is.*

**YÜNGÜLLƏŞMƏK** *f.* 1. Çəkisi azalmaq, ağırlığını itirmək, yüngül olmaq. *Arabanın yükü yüngülləşdi.*

2. Asanlaşmaq, zəhməti, əziyyəti bir qədər azalmaq, işi azalmaq. *İşi bir qədər yüngülləşmişdir. Əmək şəraiti yüngülləşmişdi. – Axırı Xudayar bəyin yazıq övrətə bir az rəhmi gəldi. Vəliqulunu özünə cütçü, Zibanı qaravaş tutdu ki, Zeynəbin işi bir az yüngülləşsin*. C.Məmmədquluzadə.

3. Sakitləşmək, təskinlik tapmaq, beynini məşğul edən hisslərdən, fikirlərdən azad olmaq. *Dərdi yüngülləşmək*. – [Sona xanım:] *Səni görəndə könlüm açılır. Gözlərimə şəfəq gəlir, dərdimi açıb deyirəm, ürəyim bir az yüngülləşir*. Ə.Haqverdiyev.

4. Özünü yüngül hiss etmək, mədəsi təmizlənmək. *Qusandan sonra yüngülləşdi.*

**YÜNGÜLLƏTMƏK** *f.* Ağırlığını azaltmaq, çəkisini azaltmaq, daha yüngül etmək. *Yükünü yüngüllətmək.*

**YÜNGÜLLÜK** *is.* 1. "Yüngül"dən *mücər.* (*ağırlıq* ziddi). *Havanın yüngüllüyü. Paltarın yüngüllüyü. Xasiyyətin yüngüllüyü. Vəzifənin yüngüllüyü.*

2. *məc.* Yüngül hərəkət, qeyri-ciddilik. ☐ **Yüngüllük etmək** – qeyri-ciddi hərəkət etmək.

3. *məc.* Arxayınlıq, rahatlıq hissi; sevinc, fərəh. *Mədəd dərhal ürəyində ani bir yüngüllük hiss etdi*. S.Rəhimov. *Mən bu sözləri dedikcə bir yüngüllük, rahatlıq duyurdum*. Mir Cəlal. *Kərim özündə bir yüngüllük hiss edərək çıxıb getdi*. İ.Əfəndiyev.

**YÜNGÜLMƏZAC** b a x **yüngültəbiət**. *Yüngülməcaz adam.*

**YÜNGÜLMƏZACLIQ** b a x **yüngültəbiətlilik**.

**YÜNGÜLRAQ** *sif.* Olduqca yüngül, çox yüngül.

**YÜNGÜLTƏBİƏT(Lİ)** *sif.* Qeyri-ciddi, xasiyyətcə yüngül. *Yüngültəbiət adam.*

**YÜNGÜLTƏBİƏTLİLİK** *is.* Xasiyyətcə, təbiətcə qeyri-ciddilik, qeyri-ciddi adamın hal və keyfiyyəti.

**YÜNGÜLVARİ** *sif.* 1. Bir qədər yüngül. *Əl çamadanı boyda, yüngülvari bağlını əlimə aldım*. Mir Cəlal.

2. Çətin olmayan, çox mürəkkəb olmayan, çox zəhmət, bilik, bacarıq tələb etməyən; asantəhər. *Yüngülvari bir iş.*

**YÜNGÜL-YARAQ** *zərf dan.* 1. Lazımi dərəcədə silahlanmamış, hazırlanmamış.

2. Yüngül geyinmiş halda.

3. *məc.* Zəif, şiddətsiz, yüngül. *Dalğalar, ağ dalğalar; Yüngül-yaraq dalğalar*. R.Rza.

**YÜPYÜNGÜL** *sif.* Lap yüngül, olduqca yüngül, yox yüngül.

**YÜRÜK** *is.* Çapar, qasid.

**YÜRÜMƏ** "Yürümək"dən *f.is.*

**YÜRÜMƏK** b a x **yerimək**. *Fəvvarələr atır, axır bulaqlar; Yürüdüyüm yollar parlaq sədəfli*. A.Səhhət. *Rotşild də başqa zavodların nümayəndələri ilə bərabər yürüməkdə idi*. M.S.Ordubadi. *Yürüyürkən parovozlar irəli; Daşınır zəhmətimin meyvələri*. S.Vurğun.

**YÜRÜŞ** *is.* 1. İrəliyə doğru hərəkət; yerimə. *Ağır karvan yürüşü ilə dalğalanır insanlar; Həm də qızlar-oğlanlar*. S.Vurğun.

2. Hücum, axın, hərbi əməliyyat. *Qalanı yürüşlə aldılar. – Qızıl Ordu Böyük Kirəc yolundan qüdrətli və əzəmətli bir yürüşlə..* [şəhərə] *daxil olurdu*. M.İbrahimov. ☐ **Yürüş etmək** – hücum etmək, axın halında irəli

yerimək. *Dəhşətli, qüdrətli, hesabsız ləşkər; Şimaldan düz şərqə yürüş edirlər.* A.Səhhət.

3. *məc*. Müəyyən məqsəd və ya tapşırığı yerinə yetirmək, yaxud bir şeylə, ya da bir şey uğrunda mübarizə aparmaq üçün mütəşəkkil çıxış, hərəkət. *Mövhumat əleyhinə yürüş. Qənaət uğrunda yürüş.* // Səyahət məqsədi ilə təşkil edilən səfər. *Turist yürüşü*.

4. Yeriş yarışı (idman növü).

**YÜRÜŞÇÜ** *is.* Yürüşdə iştirak edən adam (b a x **yürüş** 4-cü mənada).

**YÜRÜTMƏ** "Yürütmək"dən *f.is.*

**YÜRÜTMƏK** b a x **yeritmək** 1 və 2-ci mənalarda. *Yağılar yurduna yürütsə qoşun; Oğlum, siz onda bir şir kimi qoşun.* S.Rüstəm.

**YÜYƏN** *is.* Atın başına keçirilən kəm və cilovdan ibarət qoşqu ləvazimatı. *Yüyəni atın başına keçirmək. Atın yüyənindən tutmaq. – Bir az da getmişdilər, genə Rövşən Qıratın yüyənini çəkib dönüb geri baxdı*. "Koroğlu". [Bülənd] *atın yüyənini tamamilə buraxdı*. Ə.Əbülhəsən.

◊ **Yüyəni ələ keçmək** – birindən asılı vəziyyətə düşmək, asılı olmaq, tabe olmaq. [Hikmət İsfəhaninin] *deyəsən, yüyəni* [Sərhəngin] *əlinə keçməkdə idi*. M.İbrahimov. **Yüyəni ələ vermək** – ixtiyarını başqalarının əlinə vermək, tamamilə asılı vəziyyətə düşmək, tabe olmaq. **Yüyənindən (yüyənini) çəkmək** – qarşısını almaq, saxlamaq, yığışdırmaq, həddini göstərmək. *Onun yüyənini bir az çəkmək lazımdır*. **Yüyənini ələ keçirmək** – özündən asılı vəziyyətə salmaq, özünə tabe etmək.

**YÜYƏNLƏMƏ** "Yüyənləmək"dən *f.is.*

**YÜYƏNLƏMƏK** *f.* 1. Başına yüyən keçirmək, yüyən taxmaq (atın). *Qara, göyxallı atı gül kimi təmizləyib yəhərlədi və yüyənlədi.* S.Rəhimov.

2. *məc*. Özünə tabe etmək, özündən asılı vəziyyətə salmaq.

**YÜYƏNLƏNMƏ** "Yüyənlənmək"dən *f.is.*

**YÜYƏNLƏNMƏK** *məch*. 1. Başına yüyən keçirilmək (taxılmaq). *At yüyənlənmişdir*.

2. *məc*. Başqasının tabeliyinə keçmək, başqasından asılı vəziyyətə düşmək.

**YÜYƏNLƏTMƏ** "Yüyənlətmək"dən *f.is.*

**YÜYƏNLƏTMƏK** *icb*. Atın başına yüyən taxdırmaq.

**YÜYƏNLİ** *sif.* Başına yüyən vurulmuş, yüyəni olan. *Tez yəhərli, yüyənli bir at alıb mindi, .. Çənlibelə tərəf yola düşdü.* "Koroğlu".

**YÜYƏNSİZ** *sif.* Başına yüyən vurulmamış, yüyəni olmayan. *Yüyənsiz at.*

◊ **Yüyənsiz danışmaq** – fikirləşmədən danışmaq. *Yüyənsiz danışmaq nə yana çatar; Bihürmət eylədi simü zər məni*. Q.Zakir.

**YÜY(Ü)RƏK** *sif.* Bərk qaçan; itigedən, qaçağan. [Əhməd tacirbaşı] *bir yüyrək at minib, durmagəldim özünü Həsən paşanın yanına çatdırdı.* "Koroğlu". [Qurbanəli bəy:] *Ay naçalnik, əgər sənin mahalında bir belə yüyürək at tapılsa, mən bığlarımı qırxdırmasam, qurumsağam.* C.Məmmədquluzadə.

**YÜYÜRMƏ** "Yüyürmək"dən *f.is. İndi* [Lətif] *yürüş zamanı düzgün nəfəs alır və yüyürmə sürətini daha da artırırdı.* H.Seyidbəyli.

**YÜYÜRMƏK** *f.* Qaçmaq, qoşaraq getmək, bərk getmək, qaça-qaça getmək; qoşmaq. *Hara belə yüyürürsən? Uşaqlar yüyürməkdən yoruldu. – Küçədən bir çocuq yüyürdü evə..* M.Ə.Sabir. *İtlər quyruqlarını, qulaqlarını şəkləyərək birdən-birə hürməyə, yüyürməyə başladılar.* A.Şaiq. □ **Yüyürüb-yortmaq** – çox yüyürmək, qaçmaq. **Üstünə yüyürmək** – hücum etmək, üstünə cummaq. *Əlinə silah alanlar .. düşmən üstünə yüyürdü.* Mir Cəlal.

**yüyürə-yüyürə** *zərf* Qaça-qaça, qoşaraq, çaparaq. *Yüyürə-yüyürə getmək. – Çiyni yapıncılı çobanın yüyürə-yüyürə gəldiyini görən Səməd Gülgəzi .. yarpaqların arasında gizlətdi, özü isə yenə haçaya endi.* İ.Hüseynov.

**YÜYÜRTMƏ** "Yüyürtmək"dən *f.is.*

**YÜYÜRTMƏK** *icb.* Yüyürməyə, qaçmağa, iti getməyə məcbur etmək; çapdırmaq.

**YÜYÜRÜBBƏ** *zərf dan.* Yüyürərək, yüyürə-yüyürə, qaçaraq, qaça-qaça, tez, cəld. *Düşmən piyadası .. yüyürübbə qoşaraq .. çala-çuxurlara yığılıb dolur*. Ə.Əbülhəsən.

**YÜYÜRÜK** *is.* 1. Yeni ayaq tutmağa başlayan uşağın tez və yaxşı yeriməyi öyrənməsi üçün xüsusi quruluşlu arabacıq. *Uşaq üçün yüyürük almaq*.

2. Uzanıb istirahət etmək üçün iki tərəfdən ağaca, dirəyə bağlanan tor; qamak.

**YÜYÜRÜŞMƏ** 1. "Yüyürüşmək"dən *f.is.*

2. *is.* Qaçış yarışı. *Yüyürüşmədə birincilik qazandı.*

**YÜYÜRÜŞMƏK** *qarş.* Hamı birdən yüyürmək, qaçmaq, yüyürərək gəlmək. *Balaca uşaqlar gülər sifətləri ilə biqeyd bağın xiyabanlarında qışqırtı ilə yüyürüşürlər.* Ə.Haqverdiyev. *Kəndin hər tərəfindən adamlar yüyürüşürdülər*. S.Hüseyn. // Yüyürməkdə yarışmaq.

**YÜZ** *say* 1. Doxsan doqquzdan sonra gələn rəqəm – 100. *Yüz manat. Yüz nəfər. Yüz faiz. Yüz addımlıqda. On dəfə on yüz elər.* // Başqa saylarla birlikdə. *Dörd yüz kilo. Təyyarə saatda 600 kilometr yol gedir.* □ **Yüz il** – bir əsr. *Bir taleyin əllərində cütlənmiş zərik; Yüz il qoşa atılsaq da qoşa düşmərik.* M.Araz.

2. Qeyri-müəyyən çox miqdar mənasında. *Sənə yüz dəfə demişəm ki... Yüz ildir ki, onu görməmişəm. – Yüz dəfə ölç, bir dəfə biç.* (Ata. sözü). *Gərçi, ey dil, yar üçün üz verdi yüz möhnət sana; Zərrəcə qəti-məhəbbət etmədin, rəhmət sana.* Füzuli.

◊ **Yüz**... **dəyər** – bir şeyin başqa bir şeyə nisbətən çox-çox üstünlüyünü, yaxşılığını bildirir. *Nə qədər olsa qoca gərçi Vidadi xəstə; Yenə Vaqif kimi, əlbəttə, yüz oğlana dəyər*. M.V.Vidadi. **Yüz faiz** – bax **yüzdə yüz**. [Sultan:] *Mən yüz faiz əminəm, o saatca başlardın ki, əmi, belə çal-saqqal vaxtında o yaşda adamla evlənmək sənə yaraşmaz*. İ.Hüseynov. **Yüzdə doxsan doqquzu** – demək olar ki, hamısı. *Dünyada firəng dilini və elmini mükəmməl təhsil eliyən müsəlmanların yüzdə doxsan doqquzu heç bilməz ki, orucu necə tutarlar.* C.Məmmədquluzadə. **Yüzdə yüz** – 100 faiz, tamamilə, hamısı, bütünbütünə. *Planı yüzdə yüz yerinə yetirmək*.

**yüz**... – mürəkkəb sözlərin əvvəlində bir şeyin yüz vahiddən ibarət olduğunu bildirir; məs.: yüzmanatlıq, yüzfaizlik, yüznəfərlik.

**YÜZBAŞI** *is. tar.* İnqilabdan əvvəl Azərbaycan kəndlərində kənd icması tərəfindən seçilən inzibati vəzifə sahibi. *Kənd yüzbaşısı. – Bir yüzbaşının ağız-burnunu sarıyıb, torba içində düz dəstənin qərargahına gətirirdilər...* M.Hüseyn. *Yüzbaşının heybətli səsi eşidiləndə kəndin adamları tir-tir əsərdilər.* S.Şamilov.

**YÜZBAŞILIQ** *is. tar.* Yüzbaşı vəzifəsi, rütbəsi.

**YÜZƏR** bax **yüz-yüz**.

**YÜZİLDƏNBİR** *dan.* bax **ishalotu**.

**YÜZİLLİK** *sif.* 1. Yüz il davam etmiş, bir əsrlik. *Yüzillik dövr. Yüzillik müharibə.*

2. Yüz illiyə həsr edilmiş, yüz ilin tamam olması ilə əlaqədar olan. *Yüzillik yubiley.*

**YÜZLƏRCƏ** *sif.* Bir şeyin sayca çoxluğunu bildirir. *Yüzlərcə adam. Yüzlərcə turist gəlmişdir.*

**YÜZLÜK** 1. *sif.* Yüz vahidlə ölçülən. *Yüzlük lampa.*

2. *is.* Yüzmanatlıq kağız pul. [Mərcan bəy:] *Paho, nə danışırsan? İki min manat iyirmi dənə yüzlük eləyir.* Ü.Hacıbəyov. *Ərz etdiyimdən ötrü ən azı bir diricə yüzlük lazımdır, çünki bu iş şeyxülislama qədər gedib çata bilər.* S.Rəhimov. // *sif.* Yüz manat dəyərində olan; yüzmanatlıq. *Yüzlük bilet*.

◊ **Yüzlük tərəzi** – çəkilən şey yüz dəfə yüngül daşla tarazlaşdırılan xüsusi quruluşlu tərəzi.

**YÜZMANATLIQ** bax **yüzlük** 2-ci mənada.

**YÜZÜNCÜ** "Yüz"dən *sıra s. Yüzüncü adam. Yüzüncü ev. Yüzüncü vərəqə.*

**YÜZ-YÜZ** *zərf* 1. Hər birinə və ya hər dəfəsinə yüz. *Hər yeşiyə yüz-yüz yumurta yığılmışdır.*

2. Yüzlərcə, yüzlərlə sayılacaq qədər çox. *Tək olmadım nə xoş gündə, nə tufanda; Qardaşlarım var yüz-yüz.* N.Rəfibəyli.

# Zz

**Z** Azərbaycan əlifbasının otuz ikinci hərfi. Bax **ze**.

**ZABİL** *is.* [*fars.*] *mus.* Tarda bir pərdə. *Mirzə Sadıq tarın qoluna zabil pərdəsini əlavə etmişdir.* Ə.Bədəlbəyli. □ **Zabil segahı** – Azərbaycan muğamlarından birinin adı.

**ZABİT** *is.* [*ər.*] Ordu və donanmada komanda heyətinə mənsub şəxs. *Zabit rütbəsi. Zabitlər klubu. – Axırıncı teleqraf xəbərlərindən aşkar olur ki, Trablisdə osmanlı zabiti və əsgəri tələf olubdur.* C.Məmmədquluzadə. [Sona:] *Ancaq bizim başımızda bir zabit getməmişdir.* H.Nəzərli. *Zabit papirosunu yandıraraq: – Gətirin qəhrəmanı! – dedi.* R.Rza.

**ZABİTƏ** *is.* [*ər.*] 1. Qayda, qanun, nizam, intizam. [Divanbəyi:] *Barı bu işin şükranəsinə nizamə tabe olun, əgərçi heç nizamı və zabitəni anlamırsınız.* M.F.Axundzadə.

2. Başqalarına nüfuz və təsir etmə, özünə qarşı hörmət oyandırma qabiliyyəti; nüfuz, ciddiyyət. *Onun heç zabitəsi yoxdur. – Getgedə Müqim bəy Cavanşirin zabitəsi birə yüz artır, o, sürtülüb yağlanan bir qılınc kimi bərq verirdi.* S.Rəhimov. *Xanpərinin zabitəsi əskilir, inadı azalırdı.* Ə.Vəliyev. [Sultan:] *..Bu gündən belə mənim qaradinməzliyim, nə də zabitəm səni çəkindirməməli, əl-qolunu bağlamamalıdır.* İ.Hüseynov.

**ZABİTƏLİ** *sif.* Zabitəsi olan, nizam və intizam tələb edən, çox ciddi və tələbkar olan, nüfuz və təsir gücünə malik olan. *Zabitəli adam. Zabitəli müəllim. Zabitəli müdir. – Zərrintac xanım .. dönüb zabitəli bir əda ilə Alagözü çağırdı.* S.Rəhimov. *Bəlkə, Həpir özünü zabitəli* (z.) *hiss etdirmək üçün qəzəblə gəlirdi?* Mir Cəlal. *Qız da nə isə başqa milis işçilərindən bir az seçilən bu zabitəli oğlana baxıb gülümsündü.* H.Seyidbəyli.

**ZABİTƏLİLİK** *is.* Zabitəli olma, zabitəli adamın xassəsi.

**ZABİTƏSİZ** *sif.* Zabitəsi olmayan, sözü keçməyən, tələbkar olmayan. *Zabitəsiz adam.*

**ZABİTƏSİZLİK** *is.* Zabitənin, ciddiyyətin, tələbkarlığın, nüfuzun olmadığı hal.

**ZABİTLİK** *is.* [*hərb.*] Zabit rütbəsi. *Mən zabitliyə bir adi soldat ikən nail olmuşam.* M.S.Ordubadi. [Sona:] *Yaxşı, biz zabitliyə kimi təyin edək?* H.Nəzərli.

**ZAÇÓT** [*rus.* зачёт] Ali və orta ixtisas məktəblərində tələbələrin biliyini yoxlama növü. *Zaçota hazırlanmaq. Zaçot almaq. Zaçot yazmaq. Zaçot sessiyası.* // Belə yoxlamaların keçirildiyini təsdiq edən qeyd.

**ZAD** *is.* [*ər.*] 1. Şey. *Hər zad. Heç zad yoxdur. – Nə şirindir məhəbbəttək zad olmaz; Ölənədək könül ondan yad olmaz.* M.V.Vidadi. *Mən aşıq qan ayağı; Qan əli, qan ayağı; Aşıq bir zad görübdür; Üç başı, on ayağı.* Sarı Aşıq. *Kişi, məlum zaddı ki, övrətdən güclü olar.* C.Məmmədquluzadə. *Yox idi könlünü açası bir zad; Dayanmazdı insan, olsa da polad.* H.K.Sanılı. // Bəzən söylənmək, istənilən söz yada düşmədikdə, onun əvəzinə deyilir. *O .. zadı mənə ver. – Məşədi İbad: – Mən də sən zad deyiləm, rədd ol burdan!* Ü.Hacıbəyov. □ **Heç zad** – heç bir şey. *Heç zadın üstündə şagirdi döymək .. mötəbər qaydalardan sayılırdı.* F.Köçərli. [Məşədi İbad:] *İstəyirsən mən də atam kimi səndən heç zad almayım..* Ü.Hacıbəyov.

2. Adətən başqa sözlərlə birlikdə qeyri-müəyyənlik bildirir (çox vaxt qoşulduğu sözün ifadə etdiyi şeyin əhəmiyyətsizliyini bildirir). *Ona bir az şeydən-zaddan ver. Pul nədir, zad nədir! – Xanım, mən cəlladdan-zaddan qorxan deyiləm.* "Koroğlu". [Qurbanəli:] *Bir əppəkdən-zaddan ver, zəqqumlanaq.* N.Nərimanov. [Sultan bəy Süleymana:] *Buyur, gedək o biri otağa, çaydan-zaddan içək, söhbətimizi də orada edək.* Ü.Hacıbəyov.

**ZADƏ** *is.* [*fars.*] *klas.* Oğul, övlad. *Duruyor oxşamaya zadəsini; Sevgili, nazlı xudadadəsini.* M.Hadi.

**...zadə** [*fars.*] Əsil mənası "doğulmuş, törəmiş" olub: 1) adətən isimlərə qoşularaq onların əslini, kimdən törədiyini, nəslini bildirir; məs.: şahzadə (şah nəslindən olan), bəyzadə (bəy nəslindən olan), əsilzadə (zadəgan nəslinə mənsub); 2) xüsusi isimlərə qoşularaq familiya düzəldilir; məs.: Əlizadə, Rəhimzadə, Məmmədzadə.

**ZADƏGAN** *top.* [*fars.*] Hakim sinfin yüksək kübarlar təbəqəsi, əsilzadələr; aristokratiya.

*..Bağdadda dul qadınlar və öz ərlərindən intiqam almaq istəyən zadəgan qadınların görüb istədikləri adamlarla tanış olaraq evlərinə dəvət etməsini Fəxrəddin hələ Gəncədə ikən eşitmişdi*. M.S.Ordubadi.

**ZADƏGANCASINA** *zərf* Zadəgan kimi, ağa kimi; ağacasına, kübarcasına.

**ZADƏGANLIQ** *is*. 1. Əsilzadəlik, əyanlıq, kübarlıq, aristokratlıq.

2. *məc*. Nəciblik, alicənablıq; nəcib hərəkət.

**ZAĞ[1]** *is*. [*ər*. zac] *kim*. Bəzi metalların sulfat duzu.

**ZAĞ[2]** *is*. Qılıncı, bıçağı itiləyərək verilən cila, parlaqlıq. // Ümumiyyətlə silaha verilən cila, parıltı.

**ZAĞ[3]** *is*. [*fars*.] *klas*. Qara qarğa. [Aşıq Hüseyn:] *Hüseyn düşsə cananından uzağa; Şeyda bülbül tənə vurar o zağa...* Aşıq Hüseyn. *Əgər dünyada insan və ədalət olsa idi, tərlan yerində zağ oturmaz idi*. Ə.Haqverdiyev. // *məc*. Qara, qaralıq mənasında. *Bülbül, sənin işin qandır; Aşıqlar sənə mehmandır; Tamam cəsədin əlvandır; Sinən altı zağı, bülbül*. (Qoşma).

**ZAĞA** *is*. Heyvan yuvası, mağara. *Qurd da, quş da qoy çəkilsin öz ünvanına; Bir zağa da, bir saralmış yarpaq da yurddu*. M.Araz.

**ZAĞAR** *is*. *məh*. Yoğun, yekəqarın.

**ZAĞARA** *is*. Dəri papağın aşağı və yuxarı kənarı, qırağı. // Palto yaxasına qoyulan dərinin qırağı, boynu. ☐ **Zağarası getmək (çıxmaq)** – dəri papaq və ya yaxalığın kənarları yeyilib getmək. *Aslan zağarası getmiş papağını çıxardıb əlindəki kağızı onun içinə qoydu..* M.Hüseyn. *Həm aşağıdan, həm də yuxarıdan zağarası getmiş qəhvəyi Buxara papağı elə bil büzüşüb kəlləyə qalxmışdı*. Mir Cəlal.

**ZAĞCA** *is*. *zool*. Qarğalar fəsiləsindən qara parlaq lələkli köçəri quş.

**ZAĞÇI** *is*. Silahı zağla suvaran, cilalandıran usta.

**ZAĞLAMA** "Zağlamaq"dan *f.is*.

**ZAĞLAMAQ** *f*. Cilalamaq, cila vermək. *Xəncəri* (*qılıncı*) *zağlamaq*.

**ZAĞLANMA** "Zağlanmaq"dan *f.is*.

**ZAĞLANMAQ** *məch*. Cilalanmaq, cila verilmək, parıldadılmaq. *Tüfəng zağlandı*.

**ZAĞLATMA** "Zağlatmaq"dan *f.is*.

**ZAĞLATMAQ** *icb*. Cilalatmaq, cila verdirmək.

**ZAĞLI** *sif*. Zağ verilmiş, cilalanmış, cilalı. *Zağlı tüfəng. Zağlı xəncər*. – *...Yanan lampanın qüvvətli işığı altında göy zağlı xəncər yaşıl bir parıltı buraxırdı*. S.Rəhimov. *Kölgələnməsin deyə; Bəhramın gül rəngi; Mən hazır saxlamışam; Əldə zağlı tüfəngi*. R.Rza. [Nazlı:] *Kəndçi başıbatmışa zağlı beşaçılan verin, onda özünüz görərsiniz kəndçilərin bəylər haqqında fikri nədir?* Ə.Məmmədxanlı.

**ZAĞ-ZAĞ: zağ-zağ əsmək (titrəmək)** – bərk qorxmaq, qorxudan titrəmək. [Veysəl:] *İki yüzdən artıq fəhlə səni görəndə zağ-zağ əssin, iki gədə səni tələyə salsın?* S.Vəliyev. *Özünü elə göstərmişdi ki, hamı* [Baxış bəydən] *zağ-zağ əsirdi*. Ə.Abasov. // Eyni mənada bəzən "qorxudan", "əlindən" sözləri ilə. *Ev adamları tamam yuxudan ayılıb qorxularından zağ-zağ əsdilər*. Çəmənzəminli. // Ümumiyyətlə bərk titrəmək (əsmək). *Xırda təpələri sellər oyanda; Əsər bu həmləyə dağlar da zağ-zağ*. B.Vahabzadə.

◊ **Üstündə zağ-zağ əsmək** – həddindən artıq, ifrat dərəcədə əzizləmək, sevmək, qorumaq. *Anatək övladının üstündə zağ-zağ əsir*. – *Baba, nənə və ana Aslanın üstündə zağ-zağ əsirdilər*. Ə.Vəliyev.

**ZAHI** *is*. [*fars*.] Yenicə doğmuş qadın. [Cəbrayıl bəy:] *Onda ayrı evə keçək, yaxşı deyil, zahının yanında oturmayaq*. "Qaçaq Nəbi". S*əhərisi yenə mamaça gələr, zahıya baxıb lazımi tapşırıq və dərmanlar verər, şişi-zadı yığıb evdən tullardı*. H.Sarabski. // Sif. mənasında. *İndi zahı qadını cana və qüvvətə gətirmək üçün yemək tapmaq, evi qızdırmaq lazım idi*. Ə.Vəliyev.

**ZAHILIQ** *is*. Yenicə doğmuş qadının vəziyyəti.

**ZAHİD** *is*. [*ər*.] 1. Dünyanın zövq və nemətlərindən əl çəkib vaxtını ibadətlə keçirən dindar adam. *Zahidi-xudbin nə bilsin zövqünü eşq əhlinin; Bir əcəb meydir məhəbbət kim, içən huşyar olur*. Füzuli. *Pərdeyidam eyləmiş zahid ridasın xəlq üçün*. Qövsi. *İstəyir cənnəti zahid bu qədər hiylə ilə; Əbləhin fikrini gör, dildə təmənnasına bax*. S.Ə.Şirvani.

2. *məc.* Cəmiyyətdən, insanlardan qaçaraq qapalı həyat keçirən adam haqqında. *Zahid olub, heç kəsə qarışmaz.*

**ZAHİDANƏ** *zərf* [*ər.* zahid və *fars.* ...anə] Zahid kimi. *Zahidanə yaşamaq. Zahidanə həyat keçirmək.*

**ZAHİDCƏSİNƏ** *zərf* Zahid kimi, zahidanə. *Zahidcəsinə həyat sürmək. Özünü zahidcəsinə aparmaq.*

**ZAHİDLİK** *is.* 1. Zahidin hal və vəziyyəti. *Heç birimiz müqəddəslik və zahidlik iddiası etmirik.* M.F.Axundzadə.

2. *məc.* Özünü dünyanın həzz və nemətlərindən məhrum edərək yaşama; cəmiyyətdən, insanlardan qaçaraq həyat keçirmə.

**ZAHİDVAR** [*fars.*] bax **zahidanə**. *Mən otuz il cahanda zahidvar; Bilmədim qız-qadın nədir, zinhar!* H.Cavid.

**ZAHİR** *is.* [*ər.*] 1. Açıq, aşkar, aydın, meydanda olan (*batin* müqabili). *Mən bir Fərhad, sən bir şirindəhansan; Dərdin zahir, amma özün nəhansan.* M.P.Vaqif. *Zahirdi qəmzənin cigər sökməyi; Can atmağı, nahaq qanlar tökməyi.* Q.Zakir.

2. Xarici görünüş, görkəm, üz tərəf. *Zahirdən batinə yol var.* (Ata. sözü). *Batinin əksidir fəqət zahir.* H.Cavid. [Əsgər:] *Görünür, zahiri gözəl olan kimi batini də gözəldir.* Ü.Hacıbəyov. *Qəbul otağının astanasına qədəm basan oğlanın zahirində ilk nəzərdə diqqəti cəlb edə bilən bir şey yox idi.* İ.Hüseynov. ☐ **Zahir etmək** – aşkara çıxarmaq, üzə çıxarmaq, büruzə vermək, aydın etmək, məlum etmək, bildirmək. *Saxlama nəqdiqəmi-eşqini, ey can, zahir et; Kim, verim həbsi-bədəndən çıxmağa rüsxət sana.* Füzuli. *Nami-məşuqi nə lazım zahir etmək, ey könül; El bilir, aləm bilir, gülruxlərin sultanıdır.* S.Ə.Şirvani. *Anası oğlunun cinayətini; Görərək, zahir etdi nifrətini.* M.Ə.Sabir. **Zahir olmaq** – aşkara çıxmaq, üzə çıxmaq, zühur etmək, meydana çıxmaq, görünmək. *Hər gün onun həsənatından və ədalətindən növ-növ əlamətlər xalqa zahir olurdu.* M.F.Axundzadə. *Bu əsnada yaxındakı uca dağın təpəsində gözəl bir qız surətində nurani bir kölgə zahir olur.* A.Səhhət. *Şeyx hər nə qədər səslədisə də, Gülsümdən səs zahir olmadı.* Ə.Haqverdiyev; // məlum olmaq. *Vaqif öldü, neçin yasa gəlmədin? Ya zahir olmadı bu xəbər sənə?* M.P.Vaqif. **Zahirə çıxmaq** – üzə çıxmaq, məlum olmaq, görünmək. *Divarlardan asılmış xəritələri ... olmasaydı, suvaqların töküldüyü, bişmiş kərpiclərin çılpaq qaldığı bəzi yerlərdə güllələrin dəlib açdığı dərin yaralar zahirə çıxardı.* H.Nəzərli.

**ZAHİR-BATİN** *is.* [*ər.*] İç-üz, əsil, zat, mahiyyət. *Zahir-batinini üzə çıxarmaq.*

**ZAHİRDƏ** *zərf* Üzdə, zahirən, xarici görünüşcə. *..Bir para cüvəllağı oxumuşlarımız ürəkdən gülə-gülə və zahirdə guya ağlaya-ağlaya dəstənin qabağında dolanırdılar.* C.Məmmədquluzadə. [Musa kişi] *zahirdə belə işlərə yaxın durmayırdı.* Qantəmir. *Zahirdə ədavət guya soyumuşdu.* Mir Cəlal.

**ZAHİRƏN** *zərf* [*ər.*] Xarici görünüşünə, görkəminə görə, xaricən, üzdən. *Zahirən kim gözü görməz fələki-xunxarın; Məni bu gündə görən böylə sitəmkar olmaz.* Qövsi. *..On-on beş adam zahirən seyid libasında, başlarında yaşıl əmmamə və bellərində yaşıl qurşaq hər iki tərəfdən bizi əhatə edib yapışdılar atlarımızın cilovundan.* C.Məmmədquluzadə. *Zahirən ..* [Tehranın] *sakitlik və ətalətini pozacaq bir hərəkət gözə dəymirdi.* M.İbrahimov. *Səməd zahirən, doğrudan da, mürgüləyən adama bənzəyirdi.* İ.Hüseynov. // Anlaşıldığı üzrə, məlum olduğu üzrə. *Bir cavan tazədən gəlib ərsəyə; Əcaib oğlandır, adı Məhəmməd; Zahirən özütək pak imiş əsli; Ola bilməz heç övladi-Məhəmməd.* M.P.Vaqif.

**ZAHİRİ** *sif.* [*ər.*] Xarici görünüşcə, üz tərəfdən, zahirdə olan (*batini* müqabili). *Zahiri görünüş. Zahiri oxşarlıq. Zahiri gözəllik.* – [Oğlan] *bütün zahiri əlamətlərinə: gözlərinin rəngi və üzünün cizgilərinə görə rus idi.* M.Rzaquluzadə.

**ZAHİRİLİK** *is.* Zahiri görkəm, görünüş. ☐ **Zahiriliyi yoxdur** – kifirdir, çirkindir, görkəmsizdir.

**ZAHİRPƏRƏST** *sif.* [*ər.* zahir və *fars.* ...pərəst] Ancaq zahiri görünüşə, xarici görkəmə əsasən qiymət verən.

**ZAİD** *is.* [*ər.*] *köhn.* 1. Artan, əlavə edilən. *..İstərsən əgər oğlun edə kəsb fəvaid; Həm sərvəti zaid ola, həm miknəti zaid; Tərğib elə ta kəsbi-həram eyləsin oğlun!..* M.Ə.Sabir.

2. Qədərindən artıq, lazımsız.

3. Riyaziyyatda: üstəgəl işarəsi (+).

**ZAİQƏ** *is.* [*ər.*] Dadbilmə duyğusu, qabiliyyəti.

**ZAİL** *sif.* [*ər.*] *klas*. Daimi olmayan, müvəqqəti, fani, keçici, puç. ☐ **Zail etmək (eyləmək)** – puç etmək, yox etmək, məhv etmək, heçə çıxarmaq. *Nə gözəldir sənin şirin sözlərin; Zail etdi məni ala gözlərin*. Qurbani. *Zakirəm, eylədin əqlimi zail; Olmaz belə surət, belə şəmail...* Q.Zakir. *Gərdənə yaraşır qızıl hamayıl; Görənin ağlını edibdi zayıl...* Aşıq Ələsgər. *Vaiz demə kim, zail edər əqli ziyalə; Badə gətirər mərdümi-huşyarı kəmalə.* S.Ə.Şirvani. **Zail olmaq** – keçmək, yox olmaq. *Heyhat ki, tədbir ola bu xanəxərabə; Zail olub əqli*. M.Ə.Sabir. *Vaxtı ilə* [Ceyranın] *üzündə gördüyüm solğun məhzunluq büsbütün zail olmuşdu.* S.Hüseyn. *Lakin şəhərə düşən birinci bombadan o diksinincə, elə bil, dərhal aradan bu illər qalxıb zail oldu.* Ə.Əbülhəsən.

**ZAKİR** *is.* [*ər.*] *din.* **Zikr edən** (b a x **zikr** 2-ci mənada). // Keçmişdə təkyələrdə ilahiyyat oxuyan adam. *Zakirəm, zikr eylərəm, yəni ki şeyxəm; sufiyəm; Gör nə göyçək ad ilə aləmdə məzkur olmuşam.* Nəsimi.

**ZAQS** [*rus*. Запись актов гражданского состояния] İcra Aparatının doğum, ölüm, evlənmə, boşa(n)ma, övladlığa götürmə hadisələrini qeyd edən vətəndaşlıq vəziyyəti aktları şöbəsi. *Nikahı zaqsda qeyd etdirmək. – Zaqs müdiri ortayaşlı, bozsaqqallı, həlimsimalı bir kişi idi.* T.Ş.Simurq. [Zeynalın] *fikrində vardı ki, əvvəlcə bu ayrılmaq məsələsini öz aralarında həll etsinlər, sonra zaqsa gedib bir-birilərindən ayrılsınlar.* S.Hüseyn.

**ZAL** [*alm.*] *xüs*. 1. Kütləvi yığıncaqlar və ya müxtəlif məşğələlər üçün böyük və geniş otaq. *İdman zalı. Tamaşa zalı. Gözləmə zalı. – İmtahan məclisi qurulmuşdur; Zalda skamyalar qoyulmuşdur*. A.Səhhət. *Adam o qədər idi ki, böyük zal dolmuşdu.* T.Ş.Simurq. *Gülyanaq tamaşa zalına girəndə özünü başqa aləmdə hiss etdi*. Ə.Vəliyev.

2. Geniş qonaq otağı. *Sənə dinmədikcə, əbləh, azıxıb yolun çaşırsan; Qapıda dayanmayıb da, zala doğru dırmaşırsan*. M.Ə.Sabir.

**ZALXA** *is. məh. bot.* Tutqun bənövşəyi rəngində çoxlu çiçəkləri olan zəhərli bitki.

**ZALIM** *sif.* və *is.* [*ər.*] 1. Zülm edən, zülmkar, qəddar, mərhəmətsiz, insafsız. *Zalım padşah. Zalım istismarçılar. – Mən görmüşəm, kafirim də görməsin; Nə yaman dərd imiş zalım ayrılıq.* Molla Cümə. *..Bir dəstə zalım bir yerə cəm olub və özlərinə bir başçı qərar verib minmişdilər camaatın boynuna*. C.Məmmədquluzadə. *Eh zalım xan! Zalım xan! Sən qorxub öz canından; Yurdu versən hər yada; Kor olasan dünyada.* S.Vurğun.

2. *zar*. Bəzən bacarıqlı, zirək, məharətli adam haqqında. *Avropa üləmasının övrət məsələsinə dair yazılarını oxuyanda görürsən ki, bu zalımlar dünyanın hər bir guşəsindən xəbər verirlər*. C.Məmmədquluzadə. // Eyni mənada bəzən oğlu, balası, uşağı və s. sözlərlə işlənir. *Zalım oğlu yaman güləşirdi. Zalım qızında bir səs var ki... – Ağzını açan kimi, Hacı zalım oğlu onun kimi, bəlkə ondan da yaxşı danışmağa başlayır.* C.Cabbarlı. [Mərcan bəy:] *Ay zalım balası, zalım! Məni sən aldatdın!* Ü.Hacıbəyov. *Sarı simə keç, ay zalım balası, sarı simə.* M.İbrahimov. [Qaradonlu:] *Dedi-qodu gəzdirməsə, dinclik tapmır da, zalımın qızı*. İ.Hüseynov.

◊ **Zalım sual** – çətin sual, cavab verilməsi çətin olan sorğu. *Bir tərəfdən uşaqların faciəli halları, o biri tərəfdən Zəhranın zalım sualı Zeynala artıq dərəcədə təsir etdi*. S.Hüseyn. *Bu zalım sual qılınc kimi qarşımda durdu*. T.Ş.Simurq.

**ZALIMANƏ** [*ər.* zalim və *fars.* ...anə] b a x **zalımcasına**.

**ZALIMCASINA** *zərf* İnsafsızcasına, mərhəmətsizcəsinə, qəddarcasına, amansızcasına. *Zalımcasına hərəkət etmək.*

**ZALIMLIQ** *is.* Zülmkarlıq, zülm etmə, amansızcasına incitmə, əziyyət vermə.

**ZALÓM** [*rus.*] *zool*. İri siyənək balığı.

**ZALP** [*lat.*] b a x **yaylım**[1]. *Zalp atəşi. – Zalp atılan tüfənglərin səsi tikililəri tərpədirdi*. Ə.Vəliyev.

**ZAMAN** *is.* [*ər.*] 1. Vaxt, müddət. *O hadisədən çox zaman keçdi. – Unudubsan məni xeyli zamandı*. Aşıq Ələsgər. [Birinci əyan:] *Bu qədər zaman paytaxtdan ayrıldığı heç yox*

*idi...* Ü.Hacıbəyov. *Aradan üç aya qədər bir zaman keçmişdi.* S.Hüseyn. [Beyrək] *zamanın yetişdiyini görüb yumruğunu masaya çırpdı*. M.Rzaquluzadə. // Adətən feillərdən sonra – bir hadisənin, işin baş verdiyi və ya baş vermiş olduğu vaxtı, anı bildirir. *O, danışdığı zaman mən getmişdim. – Keçəl Həmzə Çənlibeldə Dürata baxdığı zaman Qıratın da yan-yörəsinə hərlənib özünə mehriban eləmişdi*. "Koroğlu". *İkinci şəhər məktəbinə getdiyim zaman Ə.Haqverdiyevlə tanış oldum*. A.Şaiq. // Zəmanə, dövr, vaxt. *Yaxşı zamanda yaşayırıq. – Mirzənin zamanında bazarda ucuzluq idi.* Ə.Haqverdiyev. *Zamanmı, insanmı dəyişdi yoxsa*. B.Vahabzadə.

2. Fəlsəfədə: sonsuz inkişaf edən materiyanın, vaxtın davamı və ardıcıllığında təzahür edən ümumi obyektiv varlıq forması. *Məkan və zaman hər cür varlığın əsas formalarıdır.*

3. Qrammatikada: iş və hərəkətin müəyyən vaxtda icra edilib-edilmədiyini bildirən feil şəkli. *Keçmiş zaman şəkilçiləri. Qrammatik zaman anlayışı.*

◊ **Zaman keçdikcə** – yavaş-yavaş, vaxt ötdükcə, getdikcə. *Zaman keçdikcə Azərbaycan dili büllurlaşır, lüzumsuz fars, ərəb və osmanlı sözlərindən təmizlənir.* M.İbrahimov. *Zaman keçdikcə Teymurun öz çətin işi haqqındakı təsəvvürü get-gedə genişlənir.* H.Seyidbəyli. **Zamanın nəbzini tutmaq** – dövrün tələbinə uyğunlaşmaq. *Zamanın nəbzini tut ki, nə canandan, nə candan tut; Nəyin vardırsa aləmdə sən öz simana qalxan tut...* S.Vurğun. **Zamanla ayaqlaşmaq** – həyatdan geri qalmamaq, dövrün tələbincə hərəkət etmək. *..Gələcəyi ancaq zamanla ayaqlaşa bilənlər qazanacaqdı!..* M.İbrahimov. **Axır zaman** *din*. – dünyanın axırı. *Dağlar başı dumandır; Elin halı yamandır; Dövran belə dəyişib; Bəlkə axır zamandır?* (Bayatı). **Bir zaman** – 1) vaxtı ilə, bir vaxt, əvvəllər, keçmişdə. *Bir zaman onlar yaxın dost idilər. – Bir zaman oldu bir belə qovğa; Külək ilə gün etdilər dəva.* A.Səhhət; 2) az müddət, bir müddət, bir qədər vaxt. *Bir zaman durub gözlədim. – Nə xoşdur bir zaman bir dilbərin eşqində yar olmaq; Ümidi-vəsl ilə hicrində müddət biqərar olmaq.* S.Ə.Şirvani. **Çox zaman** – tez-tez, çox vaxt. *Çəkinərək çox zaman, söhbəti dəyişəydin; Mənimlə əyişəydin.* M.Müşfiq. **Eyni zamanda** – bir vaxtda, eyni vaxtda, bununla birlikdə, həm də. *O zaman ki özümüz olduq öz dustağımız; Qəlbimizə sığındı üç rəngli bayrağımız*. B.Vahabzadə. *On yeddi yaşı yenicə tamam olan Güləsər isə başına gələn əhvalatdan heç nə anlamır, elə buradaca, kolun dibində dəhşətli və eyni zamanda cazibədar bir maraqla gözlədiyi əhvalatın baş verəcəyindən qorxurdu.* İ.Şıxlı. **Heç bir zaman** – əsla, qətiyyən, heç vaxt. [Səlim:] *Haqsızlıq əfv olunmaz heç bir zaman*. H.Cavid. [Aslan bəy:] *Yox, bir söz dedimi, heç bir zaman unutmaz...* C.Cabbarlı. *Ancaq onu da deyim ki, mən heç bir zaman ölümdən qorxmamışam.* M.Hüseyn. **Heç zaman** – heç bir vaxt, əsla, qətiyyən. *Onu heç zaman unutmaram. – Dünyadan heç zaman kəsilməyəydi; Gözəl, şən nəğməli bu quş səsləri.* N.Rəfibəyli. **Hər zaman** – daim, həmişə, hər vaxt. *Plov hər zaman hazırdır, – deyə Firəngiz oyalanıb qəti bir qərarla dilləndi.* S.Rəhimov. **Nə zaman** – haçan, havaxt. *Qovuşub bahara yaşıl bağçada; Belə bəzənmisən nə zaman, budaq?* M.Dilbazi. **O zaman ki** – o vaxtda ki... onda ki...

**zaman-zaman** *zərf* Hərdən, gah-gah, vaxt-vaxt. *Könüldə qönçələnir cahan-cahan fəryad; Dilim bu vəchdən eylər zaman-zaman fəryad.* Qövsi. *Qazamat divarları uca; Qapının yarımay deşiyindən; Zaman-zaman görünür bir qoca*. R.Rza. *Zaman-zaman gözlərimi boşluqlara dikmişəm; Günün, ayın, ulduzların keşiyini çəkmişəm*. M.Rahim. *Tarix qalın bir kitabdır; Vərəqlənir zaman-zaman.* H.Hüseynzadə.

**ZAMANA** b a x **zəmanə**. *Ay zamana, zamana; Oxu qoydun kamana; Eşşəklər arpa yeyir; At həsrətdir samana.* (Bayatı). *Zamana ağırdır, Allah axırını xeyir eləsin*. H.Nəzərli.

**ZAMAZKÁ** [*rus.*] *köhn.* Şüşə ilə çərçivə aralarını və rəng çəkməzdən əvvəl dəlik-deşikləri tutmaq və ümumiyyətlə, hamar olmayan yerləri hamar etmək üçün işlədilən özlü maddə. *Pəncərələrə zamazka vurmaq.*

◊ **Zamazka qalmaq** *dan.* – arzuladığı şeyə nail olmayaraq damaq qalmaq, umsunmaq.

**ZAMAZKAÇI** *is.* Zamazka çəkən (usta). *İki gündür zamazkaçı gəlib çıxmır.*

**ZAMAZKALAMA** "Zamazkalamaq"dan *f.is.*

**ZAMAZKALAMAQ** *f.* 1. Zamazka sürtmək, zamazka ilə tutmaq, qapamaq. *Pəncərələri zamazkalamaq. Qapıları zamazkalamaq.*

2. *məc. dan.* Ört-basdır etmək, üstünü malalamaq. *Məsələni zamazkalamaq.*

**ZAMAZKALANMA** "Zamazkalanmaq"-dan *f.is.*

**ZAMAZKALANMAQ** *məch.* Zamazka sürtülmək, zamazka ilə qapanmaq.

**ZAMAZKALATMA** "Zamazkalatmaq"dan *f.is.*

**ZAMAZKALATMAQ** *icb.* Zamazka vurdurmaq, zamazka çəkdirmək.

**ZAMİN** *is.* [*ər.*] Öhdəsinə zaminlik götürən, zəmanət verən adam. [Heydər bəy:] *Hacı, mən zamin ki, bu səfərdə bulardan sənə heç bir xata yetişməsin.* M.F.Axundzadə. *Mən zaminəm ki, olmaya bir illət ilə fövt; Hər xəstəyə dəva edələr gər şərab ilə.* S.Ə.Şirvani. ☐ **Zamin olmaq (durmaq)** – birinin və ya bir işin məsuliyyətini öz üzərinə götürmək, zəmanət vermək. *Borcun yoxdur, zamin ol!* (Ata. sözü). *..Zamin olmuşam ki, topu fırlanan tapançanı bizim eloğlu Şamo düşmən əlinə keçirməz!* S.Rəhimov. **Zamin(ə) vermək** – 1) *hüq.* birinin zəmanəti (məsuliyyəti) ilə bir şəxsi müvəqqəti olaraq həbsdən azad etmək. *Müttəhimi zaminə vermək.* – [Naçalnik:] *Buları zaminə ver ta yuxarıdan cavab gəlincə.* M.F.Axundzadə. *Cinayət sübut olunana qədər Bəndalını Tahirzadəyə zaminə verdilər.* Mir Cəlal; 2) zamin kimi göstərmək. *Zeynal yenə bir çox sözlər söyləyirdi. Gah Şərifzadəni, gah Möhsünzadəni zamin verirdi ki, bundan sonra alacağı paraları tamamilə Mehribana təslim etsin.* S.Hüseyn. **Zaminə götürmək** *hüq.* – ittiham olunan bir şəxsin istənilən vaxt inzibat və ya istintaq orqanına qayıdacağı haqqında dilindən rəsmi iltizam verərək, həbsdən müvəqqəti azad etdirmək. [İbrahim bəy:] *..Zaminə götürərik.. Sən də, hacı, mənim yolumu görərsən.* N.Vəzirov. *Uzun danışıqdan sonra Xasay* [İsmiyevi] *zaminə götürdü.* M.Hüseyn. [Yüzbaşı:] *Bundan bir ay möhlət alaq, mən zaminə götürürəm.* Mir Cəlal.

**ZAMİNKAR** *is.* [*ər.* zamin və *fars.* ...kar] Üzərinə zəmanət götürən adam, zəmanətçi, zaminə götürən, zamin duran, zamin.

**ZAMİNKARLIQ** *is.* Başqasının verdiyi iltizamın yerinə yetirilməsi məsuliyyətini üzərinə götürmə, zamin olma; zaminlik.

**ZAMİNLİK** *is.* Zamin olma, məsuliyyəti öhdəsinə götürmə; zəmanət. [Naçalnik Sona xanıma:] *Sənin zaminliyin hər kəsin zaminliyindən etibarlıdır.* M.F.Axundzadə.

**ZÁMŞA** [*rus.*] Xüsusi aşılama üsulu ilə hazırlanan üstü məxmər kimi yumşaq maral, qoyun və s. dərisi. // Bu dəridən tikilmiş, hazırlanmış. *Zamşa əlcək. Zamşa tufli.*

**ZANBAĞI** *sif.* Zanbaq rəngli, zanbaq kimi göy rəngi olan. *Zanbağı çit.* – [Sona] *zanbağı kəlağayı örtmüş, belibüzməli, qollu ağ kofta, sumağı tuman geymişdi.* Ə.Əbülhəsən.

**ZANBAQ** *is.* [*ər.*] *bot.* Soğanaqlı, zəngəoxşar, ətirli çiçək. *Ağ zanbaq. Sarı zanbaq. – Açılmış güllər, göy, sarı zanbaqlar; Bir cənnətdir bu gülşən hərtərəfli.* A.Səhhət. *Gülzarı süslərkən xoş qədəmləri; Boyun bükər bənövşələr, zanbaqlar..* H.Cavid. *Zeynəbin lalə kimi olan üzü solub ağ zanbağa dönmüşdü.* S.S.Axundov.

**ZANBAQÇİÇƏKLİLƏR** *cəm bot.* Soğanaqlı, kökü yumru, bəzən də kökümsovlu çoxillik ot, yarımkol və ya ağac şəkilli bitkilər fəsiləsi.

**ZANQ, ZANQAZARANQ** *təql.* Zəngi və ya başqa metalı vurduqda onlardan çıxan səs.

**ZANQILDAMA** "Zanqıldamaq"dan *f.is.*

**ZANQILDAMAQ** *f.* Zanqıltı səsi vermək. *Zəng zanqıldayırdı.*

**ZANQILDATMA** "Zanqıldatmaq"dan *f.is.*

**ZANQILDATMAQ** *f.* Zəngi və ya metalı bir şeylə vuraraq zanqıltı səsi çıxartmaq. *Qazanı zanqıldatmaq.*

**ZANQILTI** *is.* Zəng və metal cisimləri vurduqda onların çıxardığı səs. *..Sağ tərəfdəki* "*Təzəpir*" *məscidinin minarəsindən ucalan axşam əzanının səsi, daha aşağıda sol tərəfdə* "*qızılı kilsə*" *adlanan Aleksandr kilsəsinin zəng qülləsindən qopan boğuq çan zanqıltıları vardı...* Ə.Məmmədxanlı.

**ZÁPONKA** [*rus.*] Kişi üst köynəyi qollarının manjetinə taxılan düymə. *Mahmud*

*Qəmərlinin ..* [köynəyini] *aldım. Gümüş zaponka axtarırdım.* Mir Cəlal.

**ZAPONKALI** *sif.* Zaponkası olan, zaponka taxılmış. *Zaponkalı köynək.*

**ZAR**[1] [*fars.*] *klas*. 1. Səslə, yanıqlı-yanıqlı ağlayan, inləyən, nalə edən, nalan (adətən izafətlərdə işlənir). *Aşiqi-zar. Bülbüli-zar.* // Yanıqlı-yanıqlı, həzin-həzin ağlama, inləmə; fəğan, nalə. ☐ **Zar getmək** – yanıqlı-yanıqlı ağlamaq, fəğan etmək. *Bülbül, qızılgül həsrəti; Qışı, yazı zar gedirəm.* Aşıq Abbas; // Zar-zar. *Gər nalə çəkməsin dilibimar, neyləsin? Aşıq gözüm gər ağlamasın zar, neyləsin?* Qövsi. // Fəğan, nalə. *Bülbül, bu nə nalə, fəryaddır; De, bu nə ah ilə zardır?* Molla Cümə.

2. *məc*. Zəif, üzgün, əlacsız, çarəsiz, çıxılmaz (adətən tərkiblərdə işlənir). *Cismi-zar. – Gər mən mən isəm, nəsən sən, ey yar? Vər sən sən isən, nəyəm məni-zar?* Füzuli. *Öldürən zamanda Zakiri-zarı; Əl saxla bir, qanlı qəməndən öpüm.* Q.Zakir. *İlahidən qorxun, bir insaf edin; Az incidin məni-zari, sərçələr!* Molla Cümə.

◊ **Zar qalmaq** – çarəsiz qalmaq, çıxılmaz vəziyyətdə olmaq, səfalət keçirmək. *Millət .. çobanı itmiş qoyun sürüsü kimi zar və sərgərdan qalıb, axırda əcnəbilər əlində əsir və hər qisim zülm və bəlalara giriftar olacaqdır.* F.Köçərli. **Zar etmək** – zinhara gəlmək, təngə gəlmək, usanmaq. *Şəbi-meraci-visalım məni zar etdi rəqib; Görmədim, seyr elədim çərxi-müəlladə fərəh.* S.Ə.Şirvani. **Zar olmaq** *klas*. – 1) təngə gəlmək, cana gəlmək. *Nə xoşdur bir zaman bir dilbərin eşqində zar olmaq; Ümidi-vəsl ilə hicrində müddət biqərar olmaq*. S.Ə.Şirvani; 2) ağlamaqla keçmək, ağlamaq. *Ney kimi nalə çəkib, çəng kimi zar olalım!* Qövsi. *Bənəfşə qoxulu yardan ayrılan; Gündə yasa batar, günü zar olur.* M.P.Vaqif. **Zara gəlmək** – təngə gəlmək, cana gəlmək, usanmaq. *Mən aşiqəm gülzarə; Cəmənzarə, gülzarə; Ayrılığa dözməkdən; Axır gəlib gül zarə.* (Bayatı). *Can zarə gəlib, ta ki o canənə qayıtsın.* Heyran xanım. *Artıq bunun nisyəsinin əlindən camaat zara gəlmişdi.* S.Rəhman. **Zara gətirmək** – təngə gətirmək, cana gətirmək, zinhara gətirmək, usandırmaq. *Gətirdin, ey könül, zarə məni sən ahü zarınla.* S.Ə.Şirvani.

**ZAR**[2] *is.* 1. Bədənin bəzi üzvlərini daxildən bürüyən incə nazik pərdə. *Bu sözləri elə yanıq bir səslə, miskin bir tövrlə söylədi ki, qulaqlarımın zarında hiss etdiyim sızıdan bütün vücudum titrədi*. A.Şaiq.

2. Bəzi meyvələrin nazik iç qabığı (pərdəsi). *Nar zarı. Portağal zarı.*

**ZARAFAT** 1. *is.* [*ər.*] Gülmək, əylənmək və dilxoşluq üçün deyilən söz və ya edilən hərəkət; hənək. *Kobud zarafat. – Məhbub xanım gördü Koroğlu keçdi zarafata.* "Koroğlu". *Bəndalı əvvəllər başa düşmür, Məşədi Hüseynin sözlərini zarafat, ya bir xoş söz-söhbət sayırdı.* Mir Cəlal. *Kələntərli həmişə dara düşəndə olduğu kimi, indi də zarafata əl atdı.* İ.Hüseynov. ☐ **Zarafat bir yana** – danışarkən tamamilə ciddi tona keçmək istənildikdə deyilən ifadədir. **Zarafat deyil** – ciddi məsələdir, əhəmiyyətli məsələdir. *..Camaatı ələ dolamaq zarafat deyil*. Ü.Hacıbəyov. [Sədr:] *Eyvaz kişini qınamaq olmaz. Zarafat deyil, bir il tamam olmamış kişinin sinəsinə qoşa dağ çəkildi*. Ə.Vəliyev. **Zarafat etmək (eləmək)** – əylənmək, oynamaq, dilxoşluq etmək. *Olmaya sən məni biiqrar sandın; Zarafat eylədim, ona inandın.* M.P.Vaqif. *Cumayəm, istərəm zarafat edəm; Nə fayda, yanından getməz xocası.* Molla Cümə. *Kəndlilərlə Mirzə həmişə şirin dillə zarafat eləyərək söhbət edərdi.* Ə.Haqverdiyev. [Əhməd] *buçağacan barıtla, güllə ilə zarafat eləməmişdi*. B.Talıblı. **Zarafat öz yerində** – b a x **zarafat bir yana**. **Zarafata salmaq** – zarafatla ötüşməyə, işin içindən çıxmağa çalışmaq. *Sən zarafata salıbsan, amma mən düzünü deyirəm*. M.Rzaquluzadə.

2. *zərf* **Zarafatla** şəklində: zarafat yolu ilə, zarafat tərzində, ciddi olmayaraq. *Zarafatla demək. – Sözün düzünü zarafatla deyərlər.* (Məsəl). *Elçin də atasının zarafatına zarafatla cavab verdi*. M.Rzaquluzadə.

**ZARAFATCA** *zərf* Zarafat yolu ilə; zarafatyana, zarafatla. *Aşıq Ələsgərin zarafatca arvadına söz dediyini, bundan ötrü Anaxanımın küsüb getdiyini camaatın hamısı eşitmişdi*. "Aşıq Ələsgər".

**ZARAFATCASINA** *zərf* Zarafat yolu ilə, zarafat tərzində. *Zarafatcasına demək.*

**ZARAFATCIL** b a x **zarafatçı**. *Bir küncdə oturub siqar çəkən üzügülər, zarafatcıl*

*Məmməd İsmayılov Hüseyni yaxşı tanıyır..* S.Rəhimov. *Qaradinməz, öz qabığından çıxmayan, tərs Bədir depoda hamının tanıdığı, deyib-güldüyü, dost olduğu zarafatcıl bir adam idi*. Ə.Sadıq.

**ZARAFATCILLIQ** bax **zarafatçılıq**. *Zarafatcıllığı və comərdliyi ilə məşhur Zeynalın gur səsi bu dəfə qaranlıq izdihamın başı üstündə dalğalandı*. Ə.Əbülhəsən.

**ZARAFATÇI** *sif.* və *is.* Zarafat etməyi sevən (adam); hənəkçi, zarafatcıl. *Zarafatçı adam. O yaman zarafatçıdır*. – [Bağban] *həmişə deyən, danışan, gülən, zarafatçı bir şəxs idi.* S.S.Axundov. [Bəhram] *çox zarafatçı və sözbaz idi*. Ə.Vəliyev. *Daşdəmir əmi bu zarafatdan xoşlanmış bir halda, zarafatçı gəncə eyni ahənglə cavab verdi*. M.Rzaquluzadə.

**ZARAFATÇILIQ** *is.* Zarafatçı adamın xasiyyəti.

**ZARAFATHƏNGİ** bax **zarafatyana**. *Zarafathəngi demək. Zarafathəngi söz.*

**ZARAFATLAŞMA** “Zarafatlaşmaq”dan *f.is.*

**ZARAFATLAŞMAQ** *qarş*. Bir-biri ilə zarafat etmək; hənəkləşmək. *Qızların səsində elə bir səmimi məyusluq var idi ki, heç kəs zarafatlaşmır, gülüşmürdü.* Ə.Vəliyev.

**ZARAFATSIZ** *zərf* Zarafat olmadan, ciddi; doğrudan, həqiqətən. *Bu sözü zarafatsız deyirəm. Zarafatsız danışmır*. – [Halay:] *Elədir, zarafatsız, bizim Turşsuyun bütün işıqlı dünyada bəlkə də tayı-bərabəri yoxdur*. S.Rəhimov. *Dostları Kələntərlinin haqqında deyirdilər: – Məcid çörəksiz-susuz keçinər, zarafatsız keçinməz*. İ.Hüseynov.

**ZARAFATYANA** *zərf* və *sif.* Zarafat yolu ilə, ciddi olmayaraq. *Zarafatyana söhbət. – Hətta hesab müəllimi məsələləri taxtada həll edəndən sonra, zarafatyana üzünü ona çevirər, soruşardı: – Yaqub, necədir, etirazın yoxdur ki?* Mir Cəlal. *Salehin görkəmi və işi Qorxmaza o qədər xoş gəlmişdi ki, bu dəqiqəcə onunla şirin söhbət etməyi qət edib zarafatyana bir şəkildə soruşdu*. Ə.Vəliyev. *Daşdəmir əmi zarafatyana öskürdü və bığlarını eşməyə başladı.* M.Rzaquluzadə.

**ZARANQ** *təql.* Metal cisimlərə bir şeylə toxunduqda və ya vurduqda, onların çıxardığı səs.

**ZARANQAZARANQ** *təql.* bax **zaranq**. *Plovun da ətri evi bürüyüb, qazanın qazmağını zaranqazaranq ilə qopardırlar.* C.Məmmədquluzadə.

**ZARILDAMA** “Zarıldamaq”dan *f.is.*

**ZARILDAMAQ** *f.* 1. Şiddətli həyəcan, ağrı, əziyyət, əzab və s. təsirindən zarıltı səsi çıxarmaq; inildəmək. [Sofiya:] *Allah xatirinə məndən əl çəkin, günahımı artırmayın, – deyir, ağır bir xəstə kimi zarıldayırdı*. Çəmənzəminli. *Getdikcə ağır nəfəs alan Niyaz zarıldadı*. M.İbrahimov.

2. Zar-zar ağlamaq. *Uşaq zarıldayır. – Axşamçağı soyuqdan paltonuma bürünüb bazardan keçdikdə gördüm, bir dükanın qabağında üç uşaq durub zarıldayırdı*. Çəmənzəminli. *Uşaqlar* “*mən acmışam*”, *deyə zarıldayırdı*(*lar*). C.Cabbarlı.

**zarıldaya-zarıldaya** *zərf* Zarıltı ilə; ağlaya-ağlaya, inildəyə-inildəyə. *Molla zarıldaya-zarıldaya şikayət etdi*. P.Makulu.

**ZARILDAŞMA** “Zarıldaşmaq”dan *f.is.*

**ZARILDAŞMAQ** *qarş*. Zarıldamaq (hamı bir yerdə).

**ZARILDATMA** “Zarıldatmaq”dan *f.is.*

**ZARILDATMAQ** *icb*. Zarıldamağa məcbur etmək, ağlatmaq.

**ZARILTI** *is.* Ağrıdan, əzabdan və ya şiddətli həyəcandan insanın çıxardığı səs; inilti. *Qaraca qız tamam gecəni ufultu və zarıltı ilə keçirib sübhə yaxın yuxuya getdi*. S.S.Axundov. *Eşikağası keçərkən zindandan Zamanın zarıltısını eşitdi.* Çəmənzəminli.

**ZARIMA** “Zarımaq”dan *f.is.*

**ZARIMAQ** 1. Bax **zarıldamaq**. *Xəstə zarıyır. – Sən uğursuz bir güllənin ağrılarından; Zarıyırsan pələng kimi, sinən yaralı.* S.Vurğun. *..Yeni məhbus üzü üstə yerə dəyib zarımağa başladı*. M.İbrahimov. // Ulamaq. *Hərdənbir zarıyır bayquş, yapalaq; Uzaqda tülkülər edirlər vaq-vaq*. H.K.Sanılı.

2. *f.* İnləmək, sızlamaq. [Güləndam:] *Yusif bəy ilan dili çıxardır. Elə zarıyır, elə zarıyır, adamın yazığı gəlir*. N.Vəzirov. *Həm də gözdən iraq gəlinlər, qızlar; Əlləri qoynunda zarıyar, sızlar*. S.Vurğun. *Yanır od içində bala quşcuğaz; Bəzən sayıqlayır, zarıyır az-az.* M.Rahim.

**ZARINCI** *is. məh*. Çox xəstəlik çəkib zəifləmiş adam; üzgün. *Qurbanıyam mən, sevərəm*

*narıncı; Yar-yar deyib, oldum belə zarıncı.* Qurbani. [Qaraxan:] *Elə eləmisən ki, uşağı belə zarıncı eləmisən də.* S.Rəhimov.

**ZARITMA** "Zarıtmaq"dan *f.is.*

**ZARITMAQ** *f.* Zarımasına səbəb olmaq.

**ZARI-ZARI: zarı-zarı ağlamaq** – bax **zar-zar ağlamaq** ("**zar-zar**"da). *Mən ağlaram zarı-zarı; Bu zülmü götürməz tarı.* Qurbani. *Abbas ağlar zarı-zarı; Getməz könlümün qubarı...* Aşıq Abbas.

**ZARİSOVKA** *is.* [*rus.*] 1. Şəkilçəkmə.

2. Şəkil, rəsm.

**ZAR-ZAR: zar-zar ağlamaq (zarıldamaq)** – səslə, zarıltı ilə ağlamaq, fəğan etmək. *Ey Vidadi, sənin bu puç dünyada; Nə dərdin var ki, zar-zar ağlarsan?* M.P.Vaqif. *Rədd ol qapıdan, ağlama zar-zar, dilənçi!* M.Ə.Sabir; // yanıqlı-yanıqlı, həzin-həzin ağlamaq, inləmək. *Xədicə .. uşaqlarını bağrına basıb zar-zar ağladı.* S.S.Axundov. *Muzdur bu işləri təftiş edib, o payədə mütəəssirləşdi ki, uşaq kimi zar-zar ağlamağa başladı.* S.M.Qənizadə. *Bülbül zar-zar ağlar çəməndən ayrı.* S.Rüstəm.

**ZASTÁVA** [*rus.*] Dövlət sərhədinin müəyyən sahəsini mühafizə edən hərbi hissə, habelə bu hissənin yerləşdiyi yer, məntəqə.

**ZAT** *is.* [*ər.*] 1. Əsil, mənşə, kök, nəsil, nəsəb. *Xəbər alın o namərdin zatını; Aparıbdı mərd igidin atını.* "Koroğlu". [Heydər bəy:] *Zatında şübhə olanlar öz nəsəbləri üçün şəhadətnamə qayırırlar.* M.F.Axundzadə. *Oğlumuzun, şükr kim, zatı müsəlman imiş! Bəxtəvər olsun başım, bəxtimiz oğlan imiş!* M.Ə.Sabir. ☐ **Zatına bələd olmaq** – bax **zatını tanımaq**. *Bələdəm zatına sənin, novkər; Dəyməz heç bir pula bu cür sözlər.* C.Məmmədquluzadə. **Zatına lənət** – söyüş ifadəsi. *Harda bihəya var, zatına lənət.* Q.Zakir. *Musa kişi Mübaşir Məmmədin yoğun səsini tanıdı: – Zatına lənət, – deyib tüpürdü...* M.İbrahimov. **Zatını tanımaq** – əslini, nəslini, iç üzünü, bütün varlığını tanımaq (adətən mənfi, istehzalı məna ilə). [Allahverdi:] *Zurnaçı Muğanı? Onun zatını tanıyıram.* C.Cabbarlı. **Həddi-zatında** – əslində, təbiətində, xilqətində.

2. *köhn.* Şəxs, adam, şəxsiyyət, sima. *O çox əxlaqlı bir zatdır. Böyük zat. – Bax, nə qədər sevimli, nəzakətli bir zat!* M.S.Ordubadi. *Bu zatların sayəsində də birinci ilin tədris haqqı maarif cəmiyyətləri tərəfindən verildi.* T.Ş.Simurq. // Hörmətli, mötəbər şəxs. [Südabənin anası:] *...Allaha çox şükür eləyirəm ki, mənim bircə balamın qabağına sənin kimi zatı, südü təmiz bir adam çıxarıb.* M.İbrahimov.

3. Özü, öz nəfəsi, öz varlığı. *Bitməzmi cəfa, axıra yetməzmi kəşakəş? Axırda yaxar zatını yağdıqların atəş.* M.S.Ordubadi.

4. *köhn.* Varlıq, əsil, təbiət, mahiyyət. *O küləkdir, özü vardır, zatı yox.* Xəstə Qasım.

**ZATƏLCƏNB** *is.* [*ər.*] Sətəlcəm. *Əgər zatəlcənb də tutmasan, yəqin ki bir zökəm tutacaqsan.* Ə.Haqverdiyev.

**ZATƏN** *zərf* [*ər.*] 1. Təbii olaraq, əslində, fitrətən, həqiqətdə, həddi-zatında olaraq. *Zatən muzdurların bədənləri davamlı, ruhları qüvvətli olur.* S.M.Qənizadə. *Zatən qüruba da bir şey qalmamışdı.* S.Hüseyn. *Zatən Dilbər son zamanlar tez-tez xəstələnirdi.* C.Cabbarlı.

2. *ara söz mənasında.* Daha doğrusu, əslinə baxanda, əslində. *Zatən, o haqlıdır. Zatən, deyəcək sözüm də yoxdur. – Zeynal səbəbini söyləyə bilməyəcəkdi. Zatən, buna lüzum da yox idi.* S.Hüseyn. *Qurbanqulu həmişə xalqın xeyirxahı hesab olunardı. Zatən də belə idi.* T.Ş.Simurq. *Buradakıların hamısı, zatən, həbəşi vəhşi zənn edərək ondan başqa bir hərəkət də ummurdular.* Çəmənzəminli.

**ZATIQIRIQ** *sif.* və *is. dan.* Nanəcib, fırıldaqçı, kələkbaz, etibarsız. *Babacanın əlli cür nadürüst tanışı, zatıqırıq dostu var.* Ə.Əbülhəsən.

**ZATIQIRIQLIQ** *is. dan.* Zatıqırıq adamın xüsusiyyəti.

**ZATİ** *zərf* [*ər.*] *klas.* 1. Zatında, əslində, bünövrəsində olan; anadangəlmə, fitri. *Zati xasiyyət.*

2. Bax **zatən**.

**ZATİ-ALİ** *is.* [*ər.*] *köhn.* Yüksək rütbəli şəxslərə müraciət etdikdə və ya onların haqqında danışdıqda hörmət məqamında işlənən ifadə (çox zaman cəmdə işlənir).

**ZAVAL** *is.* [*ər.*] 1. Ziyan, zərər, təbii fəlakət, afət. *Bu körpəcə meynəni qoru hər bir zavaldan; Qoy torpaqda kök salıb bərkitsin öz yerini.* S.Rüstəm. // Bəla, müsibət, xətər, qorxu. *Kahinlər axışından kəşf etmiş istiqbalı; Çox zaman qışqırığın bildirmiş o zavallı.*

Ə.Cavad. *Hünərdir keçirən bizi hər oddan; Olarmı hünərə zaval, ay Maral!* B.Vahabzadə.

2. Yox olma (etmə), tələf olma (etmə), fənaya uğrama (uğratma), məhv olma (etmə); məhv. *Fani cəhanə baxma, keçər, ömrü sevmə kim; Ömrün zəvalı var və cahanın bəqası yox*. Nəsimi. *Sizdə olan aldadıcılıq və dostlara yalan satmaq sizin təxt-tacınızın zavalını yaxınlaşdırmaqdadır.* M.S.Ordubadi.

3. *məc.* Zülm, əziyyət, işgəncə mənasında. *Yazıq Ələsgərə çoxdur zavalın; Aparır ağlımı günəş camalın*. Aşıq Ələsgər.

◊ **Zaval görməmək** – 1) sağ-salamat qalmaq, heç bir bəlaya düçar olmamaq; 2) zərər görməmək, cəzasız qalmaq. [Pişik] *heç bir zaval görməyəcəyini hiss etdi, iti caynaqlarını qabırğaya ilişdirdi.* İ.Hüseynov. **Zaval olmaz** – b a x **zaval yoxdur**. *İynə saçdım divara; Elçi göndərdim yara; Elçiyə zaval olmaz; Özüm elçiyəm yara.* (Bayatı). **Zaval tapmaq** – xəsarətə uğramaq, ziyan görmək, məhv olmaq, tələf olmaq. *Mal-qaranı zaval tapdı.* **Zaval vurmaq** – 1) ziyan vurmaq, xəsarətə uğratmaq, zay etmək, məhv etmək. *Bostanı zaval vurdu*; 2) ölüm gətirmək, fənaya uğratmaq. *Bağımda var gavalı; Başım olub havalı; Əzrail ova çıxdı; Mənə vurdu zavalı*. (Bayatı). **Zaval yetirmək** – 1) b a x **zaval vurmaq**. *Yağış bağlara çox zaval yetirdi;* 2) bədbəxtlik gətirmək, fəlakət gətirmək, məhv etmək. *Bir gün olmaz kim, ona gərdun yetirməz bir zaval*. Füzuli. *Bir zaval yetirən şahi-sərvərə; Bir şux sitəmkarə müştaq olmuşam*. Aşıq Rəcəb. *Bu dərd, billəm, məni axır öldürər; Günbəgün yetirər zavalə, gözəl!* Aşıq Mehdi. **Zaval yoxdur** – qorxu yoxdur, xətər yoxdur. [Əhməd tacirbaşı dedi:] *Bizə heç bir zaval yoxdur*. "Koroğlu". [Sozalı:] *Axı, arvad üstündə dalaşmayan kişiyə zaval yoxdur.* İ.Hüseynov. [Hümmət:] *Əgər bu tufandan qurtarsam, daha mənə zaval yoxdur*. B.Bayramov. **Zavala düşmək** – bədbəxtliyə uğramaq, bədbəxt olmaq. *Gəlmədi aftabımız, keçdi nəhar nisfdən; Gör ki, mən, ey fələk, bu gün bir nə zavalə düşmüşəm.* S.Ə.Şirvani. **Zavala getmək** – b a x **zavala gəlmək**. *Mən bilirəm, gedəcəkdir zavalə; Zənəxdan dövründə, üzar yanında*. Q.Zakir. *Şamamələr dağda dəyər; Qızılgüllər boynun əyər; Bədnəzər çoxdu, göz dəyər; Gedər zavala gözlərin!* Aşıq Məhəmməd. **Zavala gəlmək** – 1) bədbəxtliyə uğramaq, fəlakətə uğramaq, müsibətə düçar olmaq. *Hər günüm bir ildir sənsiz, a bala! Gəlməyəsən, görüm səni, zavala.* R.Rza. [Əlibaba:] *Qılıncı qın saxlar, çox sağ ol, bala! Görüm, gəlməyəsən əsla zavala!* Z.Xəlil; 2) məhv olmaq, yox olmaq, zail olmaq. *Kasıb dedi: – Maldar, uyma çox mala; Dolanır zamana, gəlir zavala*. Aşıq Əhməd. *Elə zərbə vurarıq ki, yağı gələr zavala; Bir zərbə ki qoca tarix görməmişdir yaşından.* S.Rüstəm. **Zavala vermək** – fəlakətə, məhvə uğratmaq; bədbəxt etmək. *Əbəs yerə bizi verdi zavalə; Oğrun-oğrun bəlalərə həvalə.* Q.Zakir. *O mahrudən iraq verdi qəm zavalə məni*. X.Natəvan. **Zavala yetirmək** – b a x **zavala vermək**. **Zavala yetmək** – b a x **zavala düşmək**. *Mənim baxtım yetməz heç vaxt zavala; Ağıl, kamal, tale, izzət məndə var.* Aşıq Əhməd.

**ZAVALLI** *sif.* 1. Dolu, istilik və s. nəticəsində zədələnmiş (ağac, bitki, meyvə və s. haqqında). *Zavallı alça. Zavallı yarpaqlar.*

2. Acınacaq halda olan, yazıq, biçarə, başıbəlalı, bədbəxt. *Zavallı adam. Zavallı uşaq*. – [Maral:] *Məktəbi bitirmək üzrə ikən zavallı babam tərki-həyat etdi.* H.Cavid. *Mən ürəyimdə heyifsiləndim ki, zavallı qızı məktəbdən məhrum edəcəklər.* T.Ş.Simurq. *O, insanın arıq, zəif üzünə, ağarmış saçlarına baxır və bu zavallı arvadın nə qədər böyük əzablarla yaşayıb bu yaşa dolduğunu düşünürdü.* S.Rəhman. // İs. mənasında. *Zavallı bu kənddə özü* [Telli] *kimi qərib və adamsız idi.* S.Hüseyn. *Zavallının iztirabı artmışdı və üz-gözü qıpqırmızı olmuşdu.* B.Talıblı. [Durna:] *İncə, sənin bu sözlərin Aydəmirçin çox ağır. Zavallını məhv edər*. C.Cabbarlı. *Bilmirlər zavallının qədrini, qiymətini; Duymurlar qəlbindəki böyük məhəbbətini.* S.Rüstəm.

**zavallı-zavallı** *zərf* Yazıq-yazıq, məzlum-məzlum. [Kərəm:] *Xan Əslim bağça içində; Gəzər zavallı-zavallı*. "Əsli və Kərəm".

**ZAVALLILIQ** *is.* Acınacaq halda olan adamın halı; yazıqlıq, bədbəxtlik.

**ZAVALSIZ** *sif.* Məhv olmaz, yox olmayan, zail olmayan; davamlı, dayanıqlı, daimi, həmişə yaşayan. // Zərf mənasında. *Cəlladların başı zavalsız qalmayacaq.*

**ZAVALSIZLIQ** *is.* Məhv olmama, zay olmama, həmişə qalma, yaşama, var olma; daimilik.

**ZAVİYƏ** *is.* [*ər.*] *klas.* 1. Bucaq, künc, guşə. *Bundan əlavə, cəhənnəmdə qırx zaviyə var və hər zaviyədə bir ilan var və hər ilanın qarnında üç yüz otuz əqrəb var.* M.F.Axundzadə.

2. Zahidin ibadətlə məşğul olmaq üçün çəkildiyi tənha yer, təkyə, hücrə. [Əli] *ruhani alimlərlə görüşər, dinə dair bir çox məsələlər soruşar, zaviyələrə gedər, rahiblərin həyatını öyrənməyə çalışardı*. Çəmənzəminli.

**ZAVİYƏNİŞİN** *is.* [*ər.* zaviyə və *fars.* ...nişin] 1. *köhn. din.* Zaviyədə (2-ci mənada) oturub ibadətlə məşğul olan adam; münzəvi.

2. *məc.* Tənha yerdə oturub dışarı çıxmayan adam haqqında. *O, lap zaviyənişin olub.*

**ZAVİYƏNİŞİNLİK** *is.* 1. *köhn. din*. 1. Zaviyədə (2-ci mənada) oturub ibadətlə məşğul olma; münzəvilik.

2. *məc*. Tənha yerdə oturub dışarı çıxmama.

**ZAVKOM** *is.* ["zavod komitəsi"nin ixtisarı] *köhn.* Həmkarlar ittifaqının zavod komitəsi. *Zavkom iclası*. // *dan*. Bu komitənin sədri. [Gülbahar:] *Yenə bilməyirəm bu zavkom*(*dan*) .. *nə istəyirsən*. H.Nəzərli. *Zavkom mehriban və arxayın ifadə ilə əlavə etdi.* Mir Cəlal.

**ZAVOD** [*rus.*] İri sənaye müəssisəsi. *Şəkər zavodu. Metallurgiya zavodu. Şüşə zavodu. Kənd təsərrüfatı maşınları zavodu. Zavod bacası. – Eldarın fikrinə görə, fabrik, zavodlarda və istehsalatda faydalı bir surətdə çalışa bilmək üçün qadınların savadı, yüksək təhsili olmalı imiş.* S.Hüseyn. *Hər gün səhərdən axşama kimi zavod borularından burula-burula qalxaraq, bozumtul Bakı səmasını qaraldan qatı tüstülərdən əsər-əlamət belə görünmürdü.* M.Hüseyn.

◊ **At zavodu** – b a x **at**.

**ZAVODÇU** *is. köhn. dan.* Zavod sahibi. *Bu qədər pul ancaq xozeynlərdə olur, zavodçularda olur*. S.M.Qənizadə.

**ZAVODÇULUQ** *is.* Zavod işləri ilə məşğul olma, zavod saxlama.

**ZAVODYANI** *sif.* Zavodun yanında olan, zavodun ətrafında olan. *Zavodyanı sahə. Zavodyanı təsərrüfat.*

**ZAY** [*ər.* "zaye"dən] Heç, puç; tələf olmuş, korlanmış, puç olmuş, hədər olmuş. *Öküzün taydı, işin zaydı*. (Ata. sözü). ☐ **Zay eləmək (etmək)** – puç etmək, korlayıb heç eləmək. *Göndər gəlsin Ələsgərin xələtin; Etmə əməyini zay, sarıköynək.* Aşıq Ələsgər. *Nə üçün daşı zay eyləyirsiniz, heyif deyilmi?* Mir Cəlal. **Zay məhsul** – keyfiyyəti pis olan məhsul; brak, çıxdaş. **Zay olmaq** – tələf olmaq, puç olmaq, korlanmaq, heç olmaq, hədər olmaq. *Ömür üzdüm, gün çürütdüm, zay oldum; Cismim düşüb yandı axır oda, hey!* Aşıq Kərəm. *Dost elədin hər nadanı, hər yadı; Çəkdiyim əməklər oldu zay, pəri*. R.Rza. **Zaya getmək (çıxmaq, dönmək)** – hədər yerə məhv olmaq, puç olmaq, hədər getmək. *Buradan bir maya getdi; Sallandı, çaya getdi; Yolunda cəfa çəkdim; Əməyim zaya getdi*. (Bayatı). *Yar salmır üstümə saya; Cavan ömrüm gedir zaya*. Aşıq Ələsgər. *Tökdüyünüz qanlar getməsin zaya; Çıxın bu qarışıq imtahanlardan.* S.Vurğun. **Zaya vermək** – b a x **zay eləmək (etmək)**. *Yandırdı qəlbimi camalın şövqü; Ağlımı veribdir zaya qaşların*. "Aşıq Qərib". *Əsmər burdan getsə boş qalar bağlar; Sən vermə ömrümü zaya, xoş gəldin*. "Abbas və Gülgəz". *Yazıq aşıq vermə ömrünü zaya; Dərd bilən can bu yerlərdə tapılmaz.* Aşıq Ələsgər.

**ZAYE** [*ər.*] *klas.* b a x **zay**. ☐ **Zaye etmək (eyləmək)** – b a x **zay etmək (eləmək)** ("**zay**"da). *Vəchindəki bənzər ay olar zaye; Verdilər ömrümü, ay olar zaye.* M.P.Vaqif. [Molla İbrahimxəlil:] *Mən sizə yaxşılıq etmək fikrindəyəm, siz mənim əməyimi və cəfamı zaye etmək fikrindəsiniz!* M.F.Axundzadə. *Yıxdın evimi, eylədin övladımı zaye; İş keçdi məhəldən*. M.Ə.Sabir. **Zaye olmaq** – b a x **zay olmaq** ("**zay**"da). *Hala ki, xəsarət oldu vaqe; Sərmayələrin tamam zaye.* Füzuli.

**ZE** "Z" hərfinin və bu hərflə işarə olunan samitin adı.

**ZEBR** [*fr.*] *zool.* Dərisi zolaq-zolaq olan Afrika vəhşi atı.

**ZEBÚ** *is.* [*fr.*] *zool.* Çiyin sahəsində donqarı olan qaramal növü. *Lənkəran sahəsində buynuzlu mal-qaranın xüsusi növü olan zebu bəslənir.*

**ZEFÍR** [*yun*. zerhyros] 1. Eşilmiş, ağardılmış iplikdən toxunmuş zərif pambıq parça növü.

2. Yüngül meyvə pastilası (şirniyyat növü). *Şokoladlı zefir*.

**ZEH** *is.* [*fars*.] 1. Yay kirişi. *Kamanın zehi*.

2. Paltar və s.-nin qırağına tikilən qaytan, köbə, haşiyə. *Paltarın kənarına zeh tikmək*. // Səhifənin ətrafına çəkilən haşiyə, cizgi. *Kitabın vərəqinə zeh çəkilir*. // Pəncərənin, divarın kənarına vurulan və ya çəkilən haşiyə. *Qapının zehi. – Xanım Balacayeva ərini indicə orada, Saçlı ilə bir yerdə zənn edərək, qüvvətli bir təpik çaldı. Qapı divarın zehinə dəyib səsləndi*. S.Rəhimov.

**ZEHİN** *is.* [*ər*.] 1. İnsanda düşünmə, anlama və yaddaş qabiliyyəti; dərrakə, istedad. *Bu uşağın yaxşı zehni var. Onun heç zehni yoxdur*. – [Ağa Bəşir:] *Ağa, maşallah sizin zehninizə və fərasətinizə!* M.F.Axundzadə. // Hafizə, yaddaş, xatir. *Zehnində qalmamaq. İyirmi il əvvəl oxuduqlarım indi də zehnimdədir. – Qocanın dediyi sözlər Şiraslanın zehnində nəqşləndi*. S.Rəhimov. *Ağabala təkrar uşağın zehnini yoxlamaq istədi*. Mir Cəlal.

2. Fikir, xəyal. *Zehnini məşğul edən sözləri babasına deyə bildiyi üçün sevindi, yüngüllük duydu*. Mir Cəlal. *Nədənsə o zaman mənim zehnimi bir şey məşğul etmişdi:* "*O kişi sizin nəyinizdir və yaxud siz onun nəyi ola bilərsiniz?*" S.Hüseyn. ☐ **Zehni açılmaq** – fikirləşmək, düşünmək qabiliyyəti bərpa olmaq, yaxşılaşmaq, başında yüngüllük hiss etmək. *..Üzümü yudum, bir qədər zehnim açıldı*. C.Məmmədquluzadə. **Zehni qaralmaq** – fikrini bir yerə toplaya bilməmək; düşünmək, fikirləşmək qabiliyyətini itirmək.

**ZEHİNLİ** *sif.* Yaxşı zehni, yaddaşı, hafizəsi, istedadı olan; dərrakəli, istedadlı. *Zehinli tələbə. – Sona .. dərk etmək qabiliyyətinə malik, zehinli bir qız idi*. Ə.Əbülhəsən.

**ZEHİNLİLİK** *is.* Yaxşı zehni, hafizəsi, istedadı olma.

**ZEHİNSİZ** *sif.* Zehni olmayan, qavrayış qabiliyyəti zəif olan; key, küt.

**ZEHİNSİZLİK** *is.* 1. Zehinsiz adamın halı; hafizəsizlik, istedadsızlıq; keylik, kütlük.

2. Hafizəsizlik, xatirdə saxlaya bilməmə.

**ZEHLİ** *sif.* Zehi olan, kənarında haşiyəsi olan. *Zehli kitab. Zehli pəncərə. Zehli divar*.

**ZEHNİ** *sif.* [*ər*.] Zehin, ağıl, beyinlə əlaqədar olan. *Zehni əmək*.

**ZEHNİAÇIQ** *sif.* Açıq düşüncəli, aydın fikirli, tez anlayan, çox dərrakəli. *Zehniaçıq adam*.

**ZEHNİAÇIQLIQ** *is.* Düşüncəlilik, dərrakəlilik, tez anlama.

**ZEHNİYYƏT** *is.* [*ər*.] İnsanın öz zehninə görə həyat və varlıq haqqında fikirləri, dünyagörüşü. [Səlim:] *Müasir bir adam olmaq üçün yalnız şəklimizi dəyişmək kifayət etməz. Bir az ruhumuzu və zehniyyətimizi də dəyişmək lazım gələcəkdir*. S.Hüseyn.

**ZÉMSTVO** *is.* [*rus*.] *tar*. İnqilabdan qabaqkı Rusiyada: tərkibi əsasən zadəgan-burjua nümayəndələrindən ibarət olan məhdud hüquqlu yerli idarə. *Zemstvo idarələri. Zemstvo yığıncağı. Zemstvo hakimi. – Sonra müəllim, zemstvo və hökumət məktəblərinə nisbətən bu məktəbdə oxuyan şagirdlərin yazı ləvazimatı ilə daha yaxşı təmin olunmasından danışdı*. Çexovdan.

**ZEND** [əsli sanskritcədən] *tar*. Zərdüştilərin dini kitabı olan "Avesta"nın pəhləvi dilinə tərcüməsi. [Ceyniz:] *Boş vaxtlarımı atamdan qiraət öyrənirdim. İlk əvvəl* "*Zend*" *oxumağa başladım*. Çəmənzəminli.

**ZENİT** [*fr*. əsli *ər*.] *astr*. 1. Göyün, baş üstündəki ən uca xəyali nöqtəsi. *Günəş heç vaxt qütblərdə zenitdə durmur, əksinə, ekvator boyunca Günəş həmişə zenitdə dayanır*.

2. *məc*. Ən yüksək dərəcə, ən yüksək nöqtə, zirvə. *Günəş qalxanda zenitə; az qalır bir ovuc içində; kölgəmiz də itə*. R.Rza.

◊ **Zenit topu** – uçan təyyarələri vurmaq üçün xüsusi top. *Zenit toplarından atəş açıldı. – Ağız-ağıza vermiş zenit topları aramsızcasına göylərə açılırdı*. S.Rəhimov. *..Gəmi*(*nin*) *göyərtəsində də zenit topları var idi*. Ə.Əbülhəsən.

**ZENİTÇİ** *is. hərb*. Zenit topçusu, təyyarə vuran topçu. *Zenitçilərimiz düşmən təyyarələrini vurub saldılar. – Keçir baxışları göylərə dalan; Faşist quzğununu hey vurub salan; Şanlı zenitçilər böyük qürurla*. Ə.Cəmil.

**ZENKER** *is.* [*al*.] Silindrik deşiklərin giriş hissələrini, fasonlu sahələrini təmiz emal etmək üçün istifadə olunan alət. // *f*. Zenkerləmək.

**ZERZƏK** *is. məh. xüs*. Quyunu uçub dağılmaqdan qorumaq üçün onun divarlarına və ağzına hörülən daş və ya kərpic hörgü.

**ZERZƏKLİ** *sif. məh. xüs.* Zerzəyi olan. *Zerzəkli quyu.*

**ZEY** *is.* [*ər.* ziyy] Zahiri şəkil, xarici görünüş, qiyafə, paltar. ☐ **Öz zeyindən çıxmaq** – öz cızığından, öz çərçivəsindən çıxmaq, azmaq.

**ZEYİL** *is.* [*ər.*] *köhn.* 1. Ətək, paltarətəyi.

2. Artırma, qeyd, əlavə (kitab barəsində).

3. Mətnə dair təsvir və şərh.

4. Aşağıda göstərilən.

**ZEYTUN** *is.* [*ər.*] Zeytunkimilər fəsiləsindən bitki cinsi. Meyvəsindən yeyinti sənayesində və texnikada işlədilən yağ alınır. *Abşeronda zeytun yaxşı yetişir. Zeytun 5-12 metrə qədər hündürlükdə, yarpağı bozumtul-yaşıl rəngli, həmişəyaşıl ağacdır.* H.Qədirov.

**ZEYTUNÇİÇƏKLİLƏR** *cəm bot.* Kol və ağac cinsindən olan bitki fəsiləsi. *Birgözkimilər sırasının ancaq zeytunçiçəklilər fəsiləsi vardır*. M.Qasımov.

**ZEYTUNÇU** *is.* 1. *k.t.* Zeytun yetişdirməklə məşğul olan adam.

2. *köhn*. Zeytun satan adam.

**ZEYTUNÇULUQ** *is.* Zeytunçunun işi, peşəsi, məşğuliyyəti; zeytun yetişdirmə işi.

**ZEYTUNİ** *sif.* [*ər.*] Zeytun rəngində olan, bozumtul-yaşıla çalan. *Zeytuni yarpaq*.

**ZEYTUNLUQ** *is.* Zeytun ağacları əkilmiş yer, zeytun plantasiyası.

**ZƏBAN** *is.* [*fars.*] *klas*. Dil. *Bir saat görməsəm, tuti zəbanım; Qopacaq başıma qiyamət eylə.* M.P.Vaqif. *Şəkər söhbətlidi, şirin dillidi; Tuti kimi xoş zəbanım gedibdi.* Aşıq Ələsgər. ☐ **Zəbana gəlmək** – dilə gəlmək, dillənmək. *Görcək cəmali-yarımı gəldi zəbanə şəm*. S.Ə.Şirvani. *İşlər dəyişildi – hamısı döndü zəmanə; İnsan kimi fələ, kölə də gəldi zəbanə.* Ə.Nəzmi.

**ZƏBANƏ** *is.* [*fars.*] *klas*. 1. Alov, alovun şöləsi. ☐ **Zəbanə çəkmək** – şiddətlə alovlanmaq, alışıb-yanmaq. *O ancaq evlərinin zəbanə çəkərək yandığını gördü.* Ə.Əbülhəsən.

2. Tərəzi və s. ölçü cihaz və alətlərinin dil şəklində olan hissəsi, mili. *Tərəzinin zəbanəsi.*

**ZƏBƏR** *is.* [*fars.*] Ərəb (fars) əlifbasında "ə" səsini bildirmək üçün samitlərin üzərinə qoyulan ـَ işarəsi; fəthə. *Orda ayindir şerin hər kəlməsi; Qarışıb bir-birinə zir və zəbər*. Şəhriyar.

**ZƏBƏRCƏD** *is.* [*ər.*] Keçmişdə qiymətli daşlardan sayılan, zümrüdə bənzəyən yaşıl rəngli daş. *Sabahısı gün qız oğlana bir zümrüd göndərdi. Oğlan getdi bazara, bir dənə zəbərcəd alıb qoydu bının yanına, qeytərdi dala*. (Nağıl). *Mina qəddin zəbərcəddi; Nə desən cana minnətdi*. "Qurbani". *Çəpkənin yaxasındakı zümrüd və zəbərcəd düymələri altından tellərinə sancdığı badam şəkilli almaz cıqqa .. görünürdü*. M.S.Ordubadi.

**ZƏBƏRDƏST** *sif.* [*fars.*] *köhn*. 1. Çox qüvvətli, çox güclü, qolugüclü.

2. İstedadlı, talantlı, qüvvətli. *Zəbərdəst şair.* – [Nizami:] *Fəqir bəxtəvərəm, şairəm, zəbərdəstəm; Cahan kiminsə qoy olsun, mən onda sərbəstəm*. M.S.Ordubadi.

**ZƏBƏRDƏSTLİK** *is.* Çox qüvvətlilik, qolugüclülük.

**ZƏBT** *is.* [*ər.*] Silah gücü ilə, zorla tutma, ələ keçirmə, hakimiyyəti altına alma, ixtiyarına alma; sahiblənmə, yiyələnmə. *Qalanın zəbti. Şəhərin zəbti*. ☐ **Zəbt etmək** – 1) zorla tutmaq, ələ keçirmək, hakimiyyəti altına almaq, işğal etmək, ixtiyarına almaq, zorla sahiblənmək. *Güllücə kəndini düşmən zəbt etdi.* S.S.Axundov. [Şah Mirzə Ağa xana:] *Niyə məndən izn almamış Heratı zəbt etdin?* C.Cabbarlı. *Cəfərqulu Fərhad bəyin evlərini zəbt və özünü həbs etməyə göndərildi.* Qantəmir; // *məc*. özünə tabe etmək, yiyələnmək. *Təbiəti zəbt edib almağın zamanıdır; Kainata zəlzələ salmağın zamanıdır.* M.Müşfiq; 2) *klas.* qeyd etmək, yazmaq; 3) hafizəsi ilə tutmaq, hafizəsində saxlamaq, qavramaq.

**ZƏBTİYYƏ** *is.* [*ər.*] *köhn*. Polis nəfəri. [Həsən:] *Bu, bir əsgərə jemper satmış, zəbtiyyələr yaxalamışlar*. H.Nəzərli.

**ZƏBT-RƏBT** *is.* [*ər.*] *köhn*. Asayiş, intizam, nizam, qayda.

**ZƏBUN** *sif.* [*fars.*] *klas*. Zəif, qüvvətsiz, cansız, aciz, düşkün. *Dust bipərva, fələk birəhm, dövran bisükun; Dərd çox, həmdərd yox, düşmən qəvi, tale zəbun*. Füzuli. *Zira könlüm həvəslərin pəncəsində zəbundur; Qurtarmaram, nə etməli? Bir çarəsiz cünundur.* A.Səhhət. // Əsir, giriftar. ☐ **Zəbun etmək (eyləmək)** – 1) zəifləşdirmək, qüvvədən salmaq, cansızlaşdırmaq, düşkünləşdirmək. *Nagəhan başlayıb vəba; taun; Sardı ətrafı, xəlqi etdi zəbun*. H.Cavid; 2) əsir etmək,

giriftar etmək. [Minnət xanım:] *İnsaf eyləyin, bir baxın mənə! Mərcan eyləyir çox zəbun mənə!* Ü.Hacıbəyov. **Zəbun olmaq** – 1) zəifləşmək, qüvvədən düşmək, cansızlaşmaq, düşkünləşmək; 2) əsir olmaq, giriftar olmaq.

**ZƏBUNLUQ** *is.* Zəiflik, qüvvətsizlik, cansızlıq, acizlik, düşkünlük. *Aslanın qızarmış gözlərində olan məhzunluq və zəbunluq əlaməti Hacını da qəmgin edirdi*. C.Cabbarlı.

**ZƏBUR** *is.* [*ər.*] Dini əsatirə görə, Allah tərəfindən Davud peyğəmbərə göndərilən kitab. [Dərviş:] *Əvət, Quran, Zəbur, İncilü Tövrat; Birər röya ki zor təfsiri, heyhat!* H.Cavid.

**ZƏDƏ** *is.* [*fars.*] 1. Toxunmaq, yaxud bərk bir şey dəymək nəticəsində bir şeydə əmələ gələn əzik yeri, qopuq, qəlpə, çatdaq və s. *Bu stəkanın zədəsi var*. // Meyvələrdə qurd dəymə, yaxud dolu və s.-dən əmələ gələn xəsar. *Meyvənin zədəsi var. Bu qovunda zədə yoxdur.* ☐ **Zədə vurmaq** – 1) zədələmək; 2) *məc*. yaralamaq. **Zədə dəymək (toxunmaq)** – 1) xarab olmaq. [Ana:] *Ay oğul, bəlkə ağlına zədə toxunub.* S.Rəhman; 2) *məc*. yaralanmaq. **Zədə salmaq** – zədələmək, yaralamaq. *Müjganların salıb bağrıma zədə; Dözmək olmaz munca dərdi-bihədə*. Q.Zakir.

2. Xarici təsir nəticəsində orqanizmin bir yerində toxumanın əzilməsi, ziyan görməsi; kontuziya. *Kənd təsərrüfat işlərində müşahidə olunan zədələr cürbəcür olur.*

...**zədə** [*fars.*] Bəzi mürəkkəb sözlərin “vurulmuş, uğramış, düçar olmuş, giriftar olmuş” mənalarını bildirən ikinci tərkib hissəsi; məs.: qəmzədə, müsibətzədə, fəlakətzədə.

**ZƏDƏLƏMƏ** “Zədələmək”dən *f.is.*

**ZƏDƏLƏMƏK** *f.* Toxunaraq və ya toxunduraraq zədə vurmaq, xarab etmək, şikəst etmək, yaralamaq, əzmək, çatlatmaq və s. *Həyatın küləkləri hamıdan əvvəl gənc yarpaqları zədələyir*. M.S.Ordubadi. *Əvvəl bir ox ilə heyvanın başını zədələmişdi*. Mir Cəlal.

**ZƏDƏLƏNDİRMƏ** “Zədələndirmək”dən *f.is.*

**ZƏDƏLƏNDİRMƏK** “Zədələnmək”dən *icb.*

**ZƏDƏLƏNMƏ** “Zədələnmək”dən *f.is. Badımcanı sərin yerdə saxlamaq və zədələnmədən qorumaq lazımdır..*

**ZƏDƏLƏNMƏK** *f.* Bir şeyə toxunmaq və ya bir şey dəymək nəticəsində bir yeri əzilmək, zədə dəymək, zədə əmələ gəlmək, yaralanmaq, şikəst olmaq. *Doludan almalar ağacda zədələndi. – Düşmən təyyarəsi döyüşdə zədələndi, faşistin burnu əzildi, qan axıb ağzına dolmağa və çənəsindən süzülməyə başladı*. S.Rəhimov. *Həkim güman eləyirdi ki, yaralının böyrəyi bərk zədələnib*. Ə.Vəliyev.

**ZƏDƏLƏNMİŞ** ”Zədələnmək”dən *f.sif. Doludan zədələnmiş meyvə. Zədələnmiş bədən. – Kamil maşinisti tez əyləşdirib, özü onun yerini tutdu və zədələnmiş qayığı Aslandaşa sürdü*. M.Süleymanov.

**ZƏDƏLİ** *sif.* Zədəsi olan, zədə dəymiş; əzik. *Zədəli yer. Zədəli bədən. – Qarı isə ömrünün son çağında onun dərdini dinləyən adama zədəli qəlbi ilə hörmət bəsləyir.* S.Rəhimov. *Qayçılayanlar isə şüşə kimi ağ, qara salxımları zədəli gilədən təmizləyirdilər.* Mir Cəlal. // *məc*. Yaralı. *Bu əllər yad əlidi; Köməyim dad əlidi; Gedirsən, tez qayıt gəl; Ürəyim zədəlidi.* (Bayatı).

**ZƏDƏLİLİK** *is.* Zədəli şeyin hal və keyfiyyəti.

**ZƏDƏSİZ** *sif.* Zədəsi, nöqsanı, əziyi olmayan; bütöv, saf. *Zədəsiz şüşə. Zədəsiz meyvə.*

**ZƏDƏSİZLİK** *is.* Zədəsi olmama, bütövlük, tamlıq.

**ZƏF** *is.* [*ər.*] *klas*. Zəiflik, qüvvətsizlik, üzgünlük. *Mana bu zəfü bihallıq, sağınma, pirlikdəndir; Gözün fikri məni yorğun salıb ahu qovanlartək.* Q.Zakir. *Zəf eylədi aciz məni, qaldım əməlimdən; Çəkdim nə ziyanlıq?!* M.Ə.Sabir. *Bir dəfə Sofiya xanım studentin baxışından qorxmadı, gözlərinin içinə dik baxdı. Lakin ruhuna sükut gəlmədi. Zəfini duydu və başını yastığa söykəyərək ağladı*. Çəmənzəminli.

**ZƏFƏR** *is.* [*ər.*] *tənt*. Qalibiyyət, qələbə. *Gəncə zəfəri İbrahim xanın nüfuzunu Azərbaycan xanlıqları arasında bir qat daha artırdı*. Çəmənzəminli. *Ey zəfər nəğməsi, sən ey şən nəğmə! Qanlı cəbhələrdə döyüşən nəğmə*. N.Rəfibəyli. *Gəzib bu dost elləri, dolansan qarış-qarış; Hər yanda görəcəksən, yüksəliş, zəfər, yarış.* Ə.Cəmil. // Qalib gəlmə, üstün gəlmə. ☐ **Zəfər qazanmaq (çalmaq)** –

qalib olmaq, qələbə çalmaq. [Nüşabə:] *Ölkələr düşməni rumlu İskəndər; Hind ilə İranda qazanmış zəfər.* A.Şaiq. *Döyüşlərdə zəfər çaldın, boy atdın; Yer üzündə milyonları oyatdın.* R.Rza. **Zəfər tapmaq** – b a x **zəfər qazanmaq**. **Zəfər yetirmək** – məğlub etmək, üzərində qələbə çalmaq, yenmək. // Məqsədə nail olma, müvəffəqiyyət, nailiyyət.

◊ **Zəfər toxundurmaq** – başına xata gətirmək. [Xanımnaz:] *Ay balam, qurbanın olum, qorxuram birdən uşaqcığazıma bir zəfər toxundurmasınlar.* C.Cabbarlı. **Zəfər toxunmaq (dəymək)** – zərər, ziyan, xətər dəymək, başına xata gəlmək. *Can Koroğlu, öz canımdan qorxmuram; Qorxum odur, zəfər dəyə dostuma.* "Koroğlu". *Əhməd tacir də qızı götürüb aradan çıxdı ki, ona zəfər toxunmasın.* (Nağıl).

**ZƏFƏRAN** *is.* [*ər.*] 1. *bot.* Çiçəkləri yeyinti sənayesində istifadə olunan çoxillik soğanaqlı cənub bitkisi. *Zəfəran tarlası.* – [İbad Ocaqquluya:] *Buğda əkənlər də gərək zəfəran əksinlər.* C.Cabbarlı. // Həmin bitki çiçəklərinin, müxtəlif yemək şeylərinə ətir, tam və xüsusi rəng vermək üçün istifadə edilən qurudulmuş sarı telləri. *Xərc edir bir para əşxas pulun bayramda; Zəfərana, yağa, razyana, xaşxaşa, ətə.* M.Ə.Sabir.

2. *məc.* Sarı rəng mənasında. *Həm rəngibəhar olub xəzanım; Dönmüşdü əqiqə zəfəranım.* Füzuli. *Döşləri qurumuş, rəngi zəfəran; Budur ehtiyacın, aclığın sonu!* S.Vurğun.

**ZƏFƏRANI** *sif.* Zəfəran rəngli, sarı-narıncı rəngli. *Zəfəranı şaftalı.*

**ZƏFƏRANLI** *sif.* Zəfəran qatılmış, zəfəran vurulmuş, tərkibində zəfəran olan. *Zəfəranlı plov. Zəfəranlı bozbaş.* – *Balkonun fəzasını ətirli şərbətlərin, zəfəranlı yeməklərin qoxusu doldurmuşdu.* M.S.Ordubadi. *Üstü zəfəranlı bir plov yeyək; Bu günün eşqinə mahnılar deyək.* S.Vurğun.

**ZƏFƏRANPLOV** *is.* Zəfəranlı plov. *Görərsiniz ki, bacınız sizin üçün necə bir zəfəranplov bişirir.* S.Rəhimov. *Eşşək nə bilir zəfəranplov nədir?* (Ata. sözü).

**ZƏFƏRLİ** *sif.* Xatalı, həyat üçün təhlükəli. □ **Zəfərli yer** *dan.* – zədələnməsi həyat üçün təhlükəli olan bədən üzvü. *Nurəddini fayton basdıqdan sonra onun yaralı halında başına yığılmış adamlardan birisi dedi: – Hərgah zəfərli yerindən basmayıbsa, heç zad olmaz.* S.S.Axundov.

**ZƏFƏRYAB** *sif.* [*ər.* zəfər və *fars.* ...yab] *klas. tənt.* Müvəffəqiyyətə çatan, müvəffəqiyyət qazanan. // Qalib, qələbə çalan, qalib gələn. □ **Zəfəryab olmaq** – müvəffəqiyyət əldə etmək; // qələbə çalmaq, qalib gəlmək.

**ZƏGÖV** *is.* Çox acı və ya zəy dadlı şey.

**ZƏĞƏN**[1] *is.* [*fars.*] *klas.* Qara qarğa, dolaşa. *Tərlan yerini zağ və zəğən tutmaz.* (Ata. sözü). *Əgər dünyada insaf və ədalət olsa idi, tərlan yerində zağ və zəğən oturmaz idi.* Ə.Haqverdiyev. *Bülbül yerində indi oturmuş idi zəğən; Bülbüllərin məzarda söylər: vətən, vətən!..* M.Hadi.

**ZƏĞƏN**[2] *is.* [*ər.*] *klas.* Çənə ortasındakı çuxur. *Könül asayişi, canın rahəti; Gülgəz zənəxdanda, tər zəğəndədir.* M.P.Vaqif.

**ZƏHƏNDƏ** *sif.* və *is. dan.* Diliacı, zəhləaparan, zəhlətökən, qabadanışan, kobud (adam). *Zəhəndə adam. Zəhəndənin biridir.*

**ZƏHƏR** *is.* [*fars.*] 1. Canlı orqanizmi zəhərləndirə bilən maddə; ağı. *İlan zəhəri. Öldürücü zəhər. Zəhər vermək* (*zəhərləmək*). □ **Zəhər yemək** – özünü öldürmək üçün zəhər içmək. // *məc.* Çox acı şey haqqında. *Bu dərman lap zəhərdir.* □ **Zəhər kimi** – çox acı. // *məc.* Çox mənfi təsiri olan şey. *Şovinizm zəhəri.*

2. *məc. dan.* Mikrob mənasında. *Hindistanda Qanq çayı bizim Kür çayından çox böyükdür, ..amma bu sudan vəba zəhəri heç əskik olmur.* C.Məmmədquluzadə.

◊ **Zəhər dağarcığı (tuluğu, torbası)** *dan.* – dili çox acı adam haqqında. [Əsgər:] *..Zəhər torbası yuxudan ayılıb gəlmək istəyir.* N.Vəzirov. **Zəhər etmək (eləmək)** – b a x **zəhər qatmaq**. **Zəhər içirtmək** *məc.* – həyatını zəhərləmək, gününü qara eləmək, həyatını əziyyətə salmaq. *Namərdləri oylaqlardan köçürtdüm; Yağı düşmənlərə zəhər içirtdim.* "Koroğlu". **Zəhər qatılmaq** – tamamilə korlanmaq, zəhərlənmək. *Ogünkü nəşəmə zəhər qatılmış olduğundan çox dalğın idi*(*m*).. A.Şaiq. *Niyə zəhər qatılsın kişinin nəşəsinə..* B.Vahabzadə. **Zəhər qatmaq** *məc.* – tamamilə korlamaq, pozmaq, xarab etmək, zəhərləmək. **Zəhər uddurmaq** – b a x **zəhər içirtmək**. **Zəhər yeyəsən!** *dan.* – qarğış, nifrin, söyüş ifadəsi. **Zəhərə döndərmək**

– b a x **zəhər qatmaq**. *Bir stəkan çay verdi, onu da zəhərə döndərdi*. **Zəhərə dönmək** – pozulmaq, xarab olmaq, pis, acı bir şeylə əvəz olunmaq. *Yediyimiz zəhərə döndü*. **Üz-gözündən (sifətindən) zəhər tökülmək (yağmaq)** – çox qaşqabaqlı olmaq, acıqlı, qəzəbli görünmək.

**ZƏHƏRLƏMƏ** "Zəhərləmək"dən *f.is.*

**ZƏHƏRLƏMƏK** *f.* 1. Ağılamaq, zəhərlə təsir etmək, zəhər vermək, zəhər içirmək, zəhər verib öldürmək, zəhərli maddələrlə öldürmək, qırmaq. *Qazla zəhərləmək. – Qapıda bağlanmış itin səsi çıxmayırdı. Deyəsən, onu casus zəhərləmişdi.* M.Hüseyn. ☐ **Özünü zəhərləmək** – zəhər qəbul edib özünü öldürmək, özünü öldürmək üçün zəhər içmək. *Xanım knyaginyanın gəlməyəcəyini eşidər-eşitməz şkafın yanına yüyürüb özünü zəhərləmək istədi*. M.S.Ordubadi. // *məc*. Acı, zəhərli söz deyərək, qəlbini incitmək, son dərəcə kədərləndirmək, acılamaq.

2. Zəhər və ya zəhərli maddə qatmaq. *Havanı zəhərləmək. Düşmən quyuların suyunu zəhərlədi.*

3. Zəhər və yaxud zəhərli maddənin təsiri ilə xəstələndirmək, xəstələnməsinə, pozulmasına, xarab olmasına səbəb olmaq. *İçki ilə bədənini zəhərləmək*.

4. *məc*. Korlamaq, xarab etmək, pozmaq, çox pis təsir etmək. *Kefini yaman zəhərlədilər*. – [Ceyran:] *Bu qadın mənim həyatımı zəhərləmişdi.* S.Hüseyn.

**ZƏHƏRLƏNMƏ** "Zəhərlənmək"dən *f.is. İnsan çox* [spirtli içki] *içdikdə orqanizmdə zəhərlənmə əlamətləri görünür.*

**ZƏHƏRLƏNMƏK** *f.* Bədənə zəhərli bir şey daxil olmaq nəticəsində xəstələnmək və ya ölmək. *Balıqdan zəhərlənmək. Göbələkdən zəhərlənmək. – Havada mığmığa sancır insanı; Dönüb zəhərlənir insanın qanı*. S.Vurğun.

**ZƏHƏRLƏTMƏ** "Zəhərlətmək"dən *f.is.*

**ZƏHƏRLƏTMƏK** *icb*. Zəhər verdirmək, zəhər verdirib öldürmək. *İti zəhərlətmək. Siçanları zəhərlətmək*.

**ZƏHƏRLƏYİCİ** *sif.* Zəhərlənmə əmələ gətirən, zəhərlənməyə səbəb olan, zəhərləndirib öldürən. *Zəhərləyici maddələr. Zəhərləyici qazlar.*

**ZƏHƏRLİ** *sif.* 1. Zəhəri olan; zəhərləndirici, ağılı. *Zəhərli qaz. Zəhərli maddə*. – [Naşadda] *zəhərli bir əqrəb xasiyyəti vardır*. S.Hüseyn. *İçərimdə zəhərli ilan kimi bir acıq və kin qıvrılırdı*. M.İbrahimov. *Ovçunu sanki yeddi il susuz qalmış zəhərli bir ilan çaldı.* Ə.Məmmədxanlı. // Tərkibində zəhər maddəsi olan, zəhər qatılmış, zəhər vurulmuş. *Zəhərli dərman. – Zəhərli güllələr havanı yardı; Əşrəfin evini qığılcım sardı*. H.K.Sanılı.

2. *məc*. Acı, toxunan, sancan, qanqaraldan, kinli, istehzalı. *Zəhərli söz. Onun zəhərli dili var. – Müəllimin sözlərində zəhərli iynələr olduğunu molla Xəlil hiss edirdi.* S.Hüseyn. *Zəhərli dilləri danışır duzlu; Deyillər keçmiştək çox da quduzlu.* H.K.Sanılı.

3. *məc*. Acı, acılayıcı. *Həftələr, aylar keçir axşamlı-səhərli; Bəzən şirin, bəzən zəhərli*. R.Rza.

**ZƏHƏRLİLİK** *is.* Zəhərli şeyin halı, keyfiyyəti, xassəsi, zəhərləmə qabiliyyəti.

**ZƏHƏRSİZ** *sif.* Zəhəri olmayan, ağısız.

**ZƏHƏRSİZLƏŞDİRİCİ** *sif. kim.* Zəhəri, zəhərin təsirini yox edən, zəhərdən təmizləyən. [Nişasta lüabı] *yandırıcı, yeyici maddələrlə və yodla zəhərləndikdə zəhərsizləşdirici maddə kimi istifadə edilir.* R.Əliyev.

**ZƏHƏRSİZLİK** *is.* Zəhərsiz şeyin halı, xassəsi, keyfiyyəti.

**ZƏHİR** *is.* [*ər.*] *köhn*. Yardımçı, köməkçi, arxa.

**ZƏHLƏ: zəhləsini aparmaq (tökmək)** – təngə gətirmək, bezikdirmək, usandırmaq. *Mərdlərə can sadağa; Zəhləmi bədzat aparar.* Aşıq Ələsgər. *Balaca uşaqların səsi-küyü adamın zəhləsini aparır*. C.Məmmədquluzadə. [Zeynəb] *ədəbiyyat müəlliminin lap zəhləsini tökmüşdü*. Qantəmir. **Zəhləsi qaçmaq (getmək)** – görməyə gözü olmamaq, acığı gəlmək, sevməmək, nifrət etmək. *...Şahın münəccimbaşıdan zəhləsi getmişdi*. M.F.Axundzadə. *Bir müsəlman övrətindən zəhləsi qaçanda, gecə-gündüz səy eləyir ki, övrət ölsün, yəni vəfat etsin.* C.Məmmədquluzadə. [Məşədi İbad:] *Hərgah* [papağı] *bu cürə qoysam, onda qızın məndən zəhləsi gedər*. Ü.Hacıbəyov. [Məhbusi Kərimxana:] *Oğru kimi gizli və işsiz yaşamaqdan zəhləm gedir*. M.İbrahimov.

**ZƏHLƏAPARAN** b a x **zəhlətökən**.

**ZƏHLƏKAR** *sif.* bax **zəhləaparan**. *Usta Tapdıq üzünə qonmuş zəhləkar bir milçəyi qovurmuş kimi əlini yuxarı qaldırıb saldı..* M.Hüseyn.

**ZƏHLƏTÖKƏN** *sif.* Öz hərəkət və sözləri ilə adamı təngə gətirən, bezikdirən, usandıran, cana gətirən, bıqdırıcı. *Ancaq zəhlətökən müştəridən yaxa qurtarmaq üçün bunun da xeyri olmadı.* S.Rəhman. *Həmzənin zəhlətökən küy-kələkçi arvadının təkidinə baxmayaraq, yolda boyun-boğazlarının daş-qaşını, qızıl-gümüşünü çıxartmayanlar, indi aramla soyunub mücrü və sandıqlarına qoydular.* Ə.Əbülhəsən. // Pis, xoşagetməyən, qulağa xoş gəlməyən. *Bu zaman maşınlar qəzəblənib böyürür, tramvaylar məni yollarında görən kimi zəhlətökən bir səslə zingildəyir.* Ə.Məmmədxanlı.

**ZƏHLƏTÖKÜCÜ** bax **zəhlətökən**. [Fərraş] *gözlərini yumaraq zəhlətökücü bir ahənglə sözə başladı.* P.Makulu.

**ZƏHM** *is.* [*fars.* “səhm”dən] 1. Qorxu, vahimə, dəhşət; qorxu, vahimə, dəhşət doğuran hal, görünüş. *Dəmirçioğlu baxdı ki, bu bir yekəpər, kələ-kötür adamdı, üz-gözündən zəhm yağır.* “Koroğlu”. *Əlipaşanın zəhmi canına çökdü, səbr eləməyi məsləhət gördü.* Mir Cəlal. ◻ **Zəhmi basmaq** – qorxutmaq, bərk qorxuya salmaq, vahimələndirmək, dəhşətə gətirmək. **Zəhmi yarılmaq** – bərk qorxmaq, bağrı yarılmaq, dəhşətlənmək. *Bəli, Məhəmməd də* [devlərə] *qoşuldu. Az zaman içində bu elə pəhlivan oldu ki, kimin meydanına girsəydi zəhmi yarılardı.* (Nağıl).

2. **Zəhmlə, zəhmilə** şəklində – qəzəblə, hiddətlə, çox acıqlı bir halda. *Cənab Bax Nemətin gözlərinə elə bir zəhmlə baxdı ki, tələbənin vücuduna titrətmə düşdü.* Çəmənzəminli.

**ZƏHMƏT** *is.* [*ər.*] 1. Əmək. *Zəhmətin barı. Öz zəhmətinin bəhəri. – Əgər ki yayda zəhməti əkinçinin ziyad olur; Ziyad olursa, qış günü o da o qədr şad olur.* A.Səhhət. *Həmin yükqaldıranlardan bircəsi işləsəydi, bu yüzlərlə adamın zəhməti qat-qat yüngülləşərdi.* M.Rzaquluzadə.

2. Əziyyət, rahatsızlıq, narahatlıq. *Çox zəhmətlə başa gələn iş. Sizə zəhmət oldu. – Ya dost olma, ya zəhmətdən incimə; Dost yolunda boran, qar olacaqdı.* Aşıq Ələsgər. ◻ **Zəhmət çəkilmək** – bir şeyi əldə etmək üçün əmək sərf edilmək. *Bu sərgini yaratmaq üçün xeyli zəhmət çəkilmişdir. – Mən sizi qəsdən bu otağa əvvəlcə gətirdim, siz Bağdadda gördüyünüz gözəllərin, oxuyub-çalanların üzərində nə qədər zəhmət çəkildiyini təyin edə biləsiniz.* M.S.Ordubadi. **Zəhmət çək(in)** – xahişlə birinə müraciət (bəzən kinayə ilə deyilir). *Zəhmət çəkin, gəlin. – Bacıoğlu, sən bir balaca zəhmət çək, burada qoyunun qabağında dayan, mən çobana xəbər verim.* “Koroğlu”. [Xasməmməd:] *Sən allah Xurşid xanım, bir zəhmət çək, bu şerə sən də qulaq as!* C.Cabbarlı. *Qapıçı, qapıçı, bura zəhmət çək; Özünlə bir az da su gətir, içək.* S.Vurğun. **Zəhmət çəkmək** – 1) bir şeyi əldə etmək üçün əmək sərf etmək, işləmək, çalışmaq, əlləşmək. *Bilik əldə etmək üçün zəhmət çəkmək lazımdır;* 2) əziyyətə düşmək, narahat olmaq. *Çareyi-dərdimə zəhmət çəkməyin, ey dustlər; Dərdi-eşqə çarə olmaz, olsa Əflatun təbib.* S.Ə.Şirvani. *Mən Məşədi Həsəndən təvəqqe etdim ki, bir-iki gün zəhmət çəkib Gəncəni mənə göstərsin.* Ə.Haqverdiyev. **Zəhmət çəkmə(yin)** – lazım deyil, narahat olmayın (çox vaxt kinayə ilə deyilir). *Zəhmət çəkmə, hamısını özümüz görüb qurtararıq.* **Zəhmət haqqı** – zəhmət (iş) müqabilində verilən haqq, muzd; əmək haqqı, maaş. *Nəbi bir ilin zəhmət haqqı əvəzində bəyin bir quzusunu götürüb evlərinə qayıdır.* “Qaçaq Nəbi”. [Sarıköynəyə] *yardım olmaq üçün otağımın süpürülüb təmizlənməsini ona tapşırar, zəhmət haqqı verərdim.* S.Hüseyn. *Səlim bəy isə zəhmət haqqını ikinci dəfə azaltmağı qərara aldı.* H.Nəzərli. **Zəhmət olmasa (olmazsa)** – hörmətlə xahiş, rica bildirir. *Zəhmət olmasa, o kitabı mənə verin.* – [Böyük oğlu:] *Əgər zəhmət olmasa, siz də* [vəsiyyəti] *latın dilində* (*latın hürufatı ilə*) *yazın...* Qantəmir. **Zəhmət vermək** – narahat etmək, incitmək, əziyyət vermək. *Ey Füzuli, öldün, əfğan etmədin, rəhmət sənə; Rəhm qıldın, xəlqə əfğanınla zəhmət vermədin.* Füzuli. *Hər sənəm ki verə yarına zəhmət; Oxunur ölüncə zatına lənət.* Q.Zakir. *Çox razıyam, sizə zəhmət vermək istəmirəm.* S.S.Axundov. **Zəhmətə düşmək** – zəhmət çəkməli olmaq, əziyyət çəkməli olmaq, işləməli olmaq. **Zəhmətə qatlanmaq (qatlaşmaq)** – əziyyətə dözmək,

çətinliklərə qarşı dözümlü olmaq. *Hiss edirdim ki, Bəyim xala mənim çox işləməyimi, zəhmətə qatlaşmağımı bəyənsə də, yuxusuzluğa dözməyib bir gün yatağa düşəcəyimdən qorxurdu.* İ.Hüseynov.

**ZƏHMƏTKEŞ** [*ər.* zəhmət və *fars.* ...keş] 1. Bax **əməkçi**. *..İşçilər xüsusi mülklərin zəhmətkeşlərə təqsim olunmasını tələb edirlər*. C.Məmmədquluzadə. [Səfərəli:] *Biz deyirik hamı millətlərin zəhmətkeşləri qardaşdırlar*. H.Nəzərli.

2. Bax **zəhmətsevən**. *O, çox zəhmətkeş adamdır. – Nənəcan ağıllı, işsevən, zəhmətkeş, mehriban, qeyrətli bir arvad idi.* N.Nərimanov. *Zəhmətkeş və hünərli gəmiçi bir-iki ilin ərzində yaxşıca pul qazanıb, əlavə yeni bir barkaz və iki xırdaca gəmi aldı.* S.M.Qənizadə.

**ZƏHMƏTLİ** *sif.* 1. Zəhmət tələb edən, zəhmətlə başa gələn.

2. *məc*. Ağır. *Zəhmətli iş*.

**ZƏHMƏTSEVƏN, ZƏHMƏTSEVƏR** *is.* və *sif.* Zəhməti, əməyi, işləməyi sevən (adam). *Tüstülənər bacalar; Ocaq üstə sac olar; Zəhmətsevər gün görər; Tənbəl hər vaxt ac olar.* (Bayatı). *Xalqın əksəriyyəti əkinçidir, zəhmətsevəndir.* M.S.Ordubadi. *Müqəddəs bir aləmi var; Zəhmətsevən hər insanın*. H.Hüseynzadə.

**ZƏHMƏTSEVƏNLİK, ZƏHMƏTSEVƏRLİK** *is.* Zəhməti, işləməyi sevmə; çalışqanlıq.

**ZƏHMƏTSİZ** 1. *sif.* Zəhmət tələb etməyən, zəhmət istəməyən, asanlıqla başa gələn. *Zəhmətsiz iş.*

2. *zərf* Zəhmət çəkmədən, çalışmadan, əmək sərf etmədən. *Zəhmətsiz bal yeməzlər.* (Ata. sözü). *Halal zəhmət ilə qazanılan çit; Zəhmətsiz geyilən şaldan yaxşıdır.* Aşıq Qədir. *Qoy uşaq bilsin ki, zəhmətsiz çörək yoxdur*. S.Rəhimov.

**ZƏHMƏTSİZCƏ** *zərf* Zəhmətsiz olaraq, zəhmət çəkmədən, zəhmət sərf etmədən.

**ZƏHMƏTSİZLİK** *is.* Zəhmət tələb etməmə, zəhmət çəkməmə.

**ZƏHMLƏNDİRİLMƏ** "Zəhmləndirilmək"dən *f.is.*

**ZƏHMLƏNDİRİLMƏK** *məch.* Zəhmə salınmaq, dəhşətə salınmaq; dəhşətləndirilmək.

**ZƏHMLƏNMƏ** "Zəhmlənmək"dən *f.is.*

**ZƏHMLƏNMƏK** *f.* Zəhmi basmaq, bərk qorxmaq, dəhşətə düşmək. [Alman] *bu heykəlin səsindən zəhmlənib ala-yarımçıq rusca zarıdı.* Ə.Əbülhəsən.

**ZƏHMLİ** *sif.* 1. Zəhmi olan, baxanda öz görünüşü ilə adamda qorxu doğuran, dəhşətləndirən. // Çox böyük, çox yekə, görünüşcə əzəmətli. [Nemət] *sökük və zəhmli darvazaya yaxınlaşdıqda, orada "Dava vəkili cənab Baxa xüsusi katib aranır" deyə, yeni bir elana təsadüf etdi*. Çəmənzəminli.

2. Çox ağır, təmkinli, çox ciddi, heybətli. *Aslan müəllim zəhmli bir adam idi.* İ.Əfəndiyev. // Qaşqabaqlı, acıqlı, eyni zamanda nüfuzedici. *Teyyibə zəhmli baxışları ilə nə isə daima qorxu təlqin edən bir qadındır*. M.Hüseyn. *Sultan zəhmli nəzərlə başdan-ayağa Qoşqarı süzdü.* İ.Hüseynov.

**ZƏHMLİLİK** *is.* Zəhmli adamın halı, sifəti, görünüşü.

**ZƏHR** *klas.* bax **zəhər**. *Camlər zəhrilə məmlu şəbi-hicran içdik; Eylədik tövbə əgər göz görə, pünhan içdik.* Qövsi. *Hələ bax sən bu münəqqidlərə, hazır dayanıb; Zəhrə döndərmək üçün gündə bizim balımızı*. R.Rza.

◊ **Zəhri yarılmaq, zəhri-bağrı yarılmaq** – bərk qorxmaq, dəhşətə düşmək, bağrı yarılmaq. *O qalxmaq istədi, dəmir sarıldı; Xortdan xəyal edib, zəhri yarıldı.* Ə.Cavad. *Katibin gözü kassaya sataşan kimi zəhri-bağrı, yarıldı, o, ruh kimi uçundu*. S.Rəhimov. *Üzünə baxanda az qala* [Qədirin] *zəhri yarıldı*. Mir Cəlal.

**ZƏHRİMAR** *is.* [*fars.*] Əsil mənası "ilan zəhəri" olub, aşağıdakı mənalarda işlənir: 1) zəhər, çox acı şey mənasında. *Haq bilir ki, beli şallı hacılar; Zəhrimartək xalqın ağzın acılar*. Q.Zakir; 2) çox pis, mənfur, xoşagəlməz şey haqqında deyilir. *Əba-qabını qovza, bax, içində zəhrimarı gör.* M.Ə.Sabir; // söyüş məqamında. [Vəzir:] *Zəhrimar, zəqqum, sən mənə belə xörək yediribsən ki, bir ay da yeməsəm, acmanam*. M.F.Axundzadə. [Telli:] *..Zəhrimar, Telli, dərd, Telli.* Ü.Hacıbəyov. [Mirzə Turab:] *Zəhrimar, bəli! Neçə dəfədir ki, səni çağırıram, indi gəlib öküz kimi bəyirirsən.* B.Talıblı; // mənfur; 3) adı deyilmək istənilməyən şeyə işarə (acıqla deyilir). [Mübaşir Məmməd:] *...Musa kişi, bizi na-*

*ümid eləmə, bir-iki şüşə o zəhrimardan tap!* M.İbrahimov.

◊ **Zəhrimar olmaq, zəhrimara dönmək** – bax **zəhərə dönmək** ("**zəhər**"də). *Zəhrimara döndü ağzımın dadı; Əlimdə şərbətim ağı kəsildi.* Aşıq Ələsgər. *Mənzilə getməyə yox cürətləri; Zəhrimar olubdur kef-ləzzətləri.* H.K.Sanılı. **Zəhrimara qalsın, zəhrimara qalmış** – söyüş, qarğış ifadəsi. [Sevil:] *Nə edim, Gülüş, zəhrimara qalsın o çörək ki biz yeyirik, yazıq Balaş gecə-gündüz ac-susuz işləyir*. C.Cabbarlı. [Usta Zəfər:] *Yenə zəhrimara qalmış xəzri yeri-göyü süpürür*. M.Süleymanov.

**ZƏHRİMARLANMA** *dan.* "Zəhrimarlanmaq"dan *f.is.*

**ZƏHRİMARLANMAQ** *f. vulq. dan*. Yemək, yeyib-içmək, qarnını doyurmaq (acıqla, narazılıqla deyilir). [Mirzə Səfər oğluna:] *Gəl, axmaq balası, naharını zəhrimarlan!* Ə.Haqverdiyev. [Rəsul:] *Yumurta qabığını görsədib qışqırdı: – Bəs bunu kim zəhrimarlanıb?* Ə.Əbülhəsən.

**ZƏHRİMARLIQ** *is. vulq. dan*. Yeməyə yarar bir şey (acıq, hirs məqamında deyilir). *Bu evdə bir tikə zəhrimarlıq tapılmır*. ☐ **Zəhrimarlıq etmək** *vulq. dan*. – yemək. *Bir balaca zəhrimarlıq edib evdən çıxdım.*

**ZƏXİRƏ** *is.* [*ər.*] *köhn*. Vaxtı çatanda işlənmək üçün tədarük edilib anbarda saxlanılan ərzaq şeyləri; ümumiyyətlə ərzaq, yemək şeyləri. *Zəxirə işlərimiz də duanızın bərəkətindən, pis deyildir*. "Mol. Nəsr." *..Məlik Müəyyəd artıq Xorasandan qoşun və zəxirə göndərməkdən boyun qaçırmaqdadır*. M.S.Ordubadi.

**ZƏXM** *is.* [*fars.*] *klas*. Yara. *Ey Füzuli, eylədi hər dərdə dərman ol təbib; Bir mənim zəxmimdir ancaq bulmayan mərhəm hənuz.* Füzuli. *Ümidim var ki, ol həmdəm; Edə zəxmidilə mərhəm*. Aşıq Hüseyn. *Eşqin ilə cismim yanar, tutuşar; Sanma sinəm zəxm oluban bitişər.* Aşıq Gövhər.

**ZƏİF** *sif.* [*ər.*] 1. Cismən az qüvvətli, gücsüz. *Zəif adam. Zəif at. Zəif qol*. – [Nadir bəy:] *Məxluqatın ən şərəflisi olan insanların, hətta zəif, aciz bir qarıncanın belə qanına girmək, məncə əfvedilməz bir cinayətdir*. H.Cavid. // İs. mənasında. Gücsüz, qüvvətsiz adam. *Axırda zəiflər yavaşca başlayırlar əkilməyə və güclülər, yəni dəstə sahibləri qalırlar məclisdə.* C.Məmmədquluzadə. [Firəngiz:] *Zəiflər daima gücdən bəhs edər*. H.Cavid. // Sağlam olmayan, möhkəm olmayan, cansız, arıq, xəstələnməyə mail olan. *Zəif bədən. Zəif ciyər. Səhhətcə zəif uşaq. – Xasay qatarın səsini eşidincə sanki onun qoluna qüvvət gəldi. Elə bil, zəif ürəyi həmişəlik olaraq sağaldı*. Ə.Vəliyev.

2. Üzgün, əldən düşmüş, taqətsiz. ☐ **Zəif düşmək** – üzülmək, əldən düşmək, taqətdən düşmək. [Gövhər xanım:] *Gör nə zəif düşmüşəm?* S.S.Axundov. **Zəif eyləmək (etmək)** *klas*. – zəiflətmək, üzmək, əldən salmaq. *Dərdi-hicran ol qədr eyləmiş zəif əndamımı; Şaxi-gültək cünbüşi-badi-səbadən titrərəm.* S.Ə.Şirvani. **Zəif salmaq** – zəifləşdirmək, əldən salmaq. *Həsən bəy Zərdabi bir zaman xalqı içəridən yeyən, onun qanını soran qurdlardan danışmaqla cəmiyyəti zəif salan tüfeyliləri tapmışdı.* M.İbrahimov.

3. *məc*. Zabitəsiz, qətiyyətsiz. // İradəsiz, iradə qüvvəsi çatışmayan, aciz. [Səməd] *.. heç kimin qarşısında bu cür zəif və aciz olmamışdı.* İ.Hüseynov.

4. Lazımınca nüfuzu, gücü, başqalarına təsiri olmayan. *Zəif dövlətlər. Zəif hökmdar. – Bəzi kəndlərdə yoxsullar qrupu zəif idi.* Mir Cəlal.

5. Təsiri, gücü az olan. *Zəif dərman. Zəif zəhər.*

6. Qüvvəsi, gərginlik gücü, fəaliyyət gücü az olan. *Zəif cərəyan. Zəif külək. Nəbzi zəif* (z.) *vurur*. – *Qazmaların və çadırların ancaq bir neçəsindən çox zəif işıq gəlirdi*. Ə.Sadıq.

7. Az, əhəmiyyətsiz, kifayətsiz, pis. *Zəif qabiliyyət. Zəif intizam. Zəif iş. Zəif yoxlama. Dili zəif* (z.) *bilir. Qulağı zəif* (z.) *eşidir. – Neyləyim, qüdrətim zəifdir hələ; Görüm təbiətin kor olsun gözü!* S.Vurğun.

8. Öz işini, vəzifəsini layiqincə yerinə yetirə bilməyən, öz işini, sənətini yaxşı bilməyən, yaxşı işləməyən, işin öhdəsindən gəlməyən. *Zəif idarə başçısı. Zəif rəhbər*. // Yaxşı oxumayan, pis oxuyan. *Zəif tələbə. Zəif sinif. Zəif* (z.) *oxumaq. Riyaziyyatdan zəifdir. – Bir tələbə dərsdən zəif olanda bütün briqada zəif sayılırdı*. Mir Cəlal. // Sənətkarlıq nöqteyi-nəzərindən qeyri-mükəmməl, keyfiyyətsiz. *Zəif əsər. Zəif roman. Zəif çalğıçı.*

*Skripkaçının texnikası zəifdir. O, tarda çox zəif* (z.) *çalır*.

◊ **Zəif damar** – bir şəxsin təsirə düşə bilən ən həssas cəhəti. [Naşad] *Zeynalın zəif damarını yaxşı tapmışdı*. S.Hüseyn. **Zəif yer, zəif cəhət** – nöqsan, çatışmazlıq. *...Ovçu dostumun da bir zəif cəhəti var idi*. M.Rzaquluzadə. *Baxış bəyin bir zəif cəhəti vardı: çox şorgöz idi*. Ə.Abasov.

**ZƏİFCƏ** *sif.* Bir qədər zəif. *Zəifcə işıq. Zəifcə uşaq. Zəifcə əllər. Pəncərədən zəifcə işıq gəlir*.

**ZƏİFLƏDİLMƏ** "Zəiflədilmək"dən *f.is.*

**ZƏİFLƏDİLMƏK** *məch*. Zəif salınmaq, zəif hala salınmaq.

**ZƏİFLƏMƏ** "Zəifləmək"dən *f.is.*

**ZƏİFLƏMƏK** *f.* 1. Gücdən düşmək, qüvvətdən düşmək, əldən düşmək, halsızlaşmaq. *Xəstə gündən-günə zəifləyir. – Ustanın azarı günü-gündən şiddətlənirdi; bədəni zəifləyib gücdən düşürdü*. Çəmənzəminli.

2. Gücü, təsiri, təsir qüvvəsi, şiddəti, gərginliyi və s. azalmaq. *Şaxta zəifləmişdir. İşıq getdikcə zəifləyir. Külək gah zəifləyir, gah güclənir. – Samovarın qaynaması zəifləyib, əvvəlki gurultu sakit olmuş, ocağın alovu sönmüşdü*. H.Nəzərli. *..Əmiraslan baba Solmazın zəifləyən əlini ovcuna aldı*. S.Rəhimov.

**ZƏİFLƏNDİRİLMƏ** "Zəifləndirilmək"-dən *f.is.*

**ZƏİFLƏNDİRİLMƏK** b a x **zəiflədilmək**.

**ZƏİFLƏNDİRMƏ** "Zəifləndirmək"dən *f.is.*

**ZƏİFLƏNDİRMƏK** b a x **zəiflətmək**.

**ZƏİFLƏNMƏ** "Zəiflənmək"dən *f.is.*

**ZƏİFLƏNMƏK** b a x **zəifləmək**.

**ZƏİFLƏŞDİRİCİ** *sif.* Zəiflədən, zəiflik törədən.

**ZƏİFLƏŞDİRİLMƏ** "Zəifləşdirilmək"-dən *f.is.*

**ZƏİFLƏŞDİRİLMƏK** b a x **zəiflədilmək**.

**ZƏİFLƏŞDİRMƏ** "Zəifləşdirmək"dən *f.is.*

**ZƏİFLƏŞDİRMƏK** b a x **zəiflətmək**.

**ZƏİFLƏŞMƏ** "Zəifləşmək"dən *f.is.*

**ZƏİFLƏŞMƏK** *f.* Zəiflənmək, getdikcə zəif olmaq. *Hükəmanın da iqrarı bunadır ki, başın çanağı nazikləşib kiçildikcə, beyin də zəifləşməyə və kiçilməyə başlayır*. C.Məmmədquluzadə.

**ZƏİFLƏTMƏ** "Zəiflətmək"dən *f.is.*

**ZƏİFLƏTMƏK** *f.* Zəif salmaq, gücdən salmaq, qüvvədən salmaq, gücünü azaltmaq. // Zəif düşməsinə səbəb olmaq, taqətsiz hala gətirmək, üzmək. *Xəstəlik onu çox zəiflətmişdir. Doyunca yatmamaq adamı zəiflədib gücdən salır*.

**ZƏİFLİK** *is.* 1. Qüvvə azlığı, gücsüzlük. *İşığın zəifliyi. Motorun zəifliyi*. // Üzgünlük, taqətsizlik, qüvvətsizlik, xəstəlik halı, fiziki qüvvə azlığı, arıqlıq. *Qıçlarında zəiflik hiss etmək*. – [Qızın] *çöhrəsində bir yorğunluq və zəiflik hiss olunurdu*. M.S.Ordubadi. [Gülara] *zəiflikdən bir skelet şəklini almışdı*. Ə.Vəliyev.

2. Bir şeyin yerinə yetirilməsində lazımınca möhkəmlik, səbat və ardıcıllıq olmaması; iradəsizlik, qətiyyətsizlik, acizlik, bacarıqsızlıq, qabiliyyətsizlik. *Rəhbərliyin zəifliyi. Bütün günah onun zəifliyindədir*. – [Qadir] *özünün zəifliyindən o qədər acıqlandı ki..* Ə.Əbülhəsən. □ **Zəiflik göstərmək** – acizlik göstərmək, iradəsizlik göstərmək. // Kifayətsizlik, yarıtmazlıq, qüsurluluq, nöqsanlılıq, nöqsan, qüsur. *Aparılan işlərin zəifliyi. Təşkilat cəhətdən zəiflik. Eşitmə* (*görmə*) *qabiliyyətinin zəifliyi*. // Azlıq, çatışmazlıq. *Əqli zəiflik. Orqanizmdə vitaminlərin azlığı zəifliyə və ya xəstəliyə səbəb olur*.

**ZƏKA** *is.* [*ər.*] Bir şeyi tez anlama, tez dərk etmə, tez qavrama qabiliyyəti, zehin kəskinliyi; ağıl, fəhm, zehin. [Uluca:] *Kimdə var əql, zəka, əzm, hünər; Hər nəhəngi o, məharətlə yenər*. A.Şaiq. *Bəşir məni gördükdə arvadının oxumağa olan həvəsindən, səyindən, zəkasından söylərdi...* S.S.Axundov. [Məhsəti:] *Mənim nəzərimdə Nizamini dağlar qədər əzəmətli göstərən də onun zəkasıdır*. M.Hüseyn.

**ZƏKALI** *sif.* Zəkası olan, fəhmli, zehinli, ağıllı, fərasətli, istedadlı, zəkası kəskin. *Zəkalı qız. – Uşaq zəkalıydı, alnı ay kimi*. S.Vurğun. *Zəkalı adamdı. Bir dəfə eşitdiyi söz həmişəlik hafizəsində qalırdı*. S.Rəhman.

**ZƏKALILIQ** *is.* Zəkalı adamın xassəsi; zəka sahibi olma, zehinlilik, fəhmlilik, istedadlılıq.

**ZƏKASIZ** *sif.* Zəkası olmayan, fəhmsiz, zehinsiz, istedadsız.

**ZƏKASIZLIQ** *is.* Zəkasız adamın xassəsi; idraksızlıq, zehinsizlik, fəhmsizlik, fərasətsizlik, istedadsızlıq.

**ZƏKAT** *is.* [*ər.*] İslam dinində: əldə edilmiş mal və pulun halallığını təmin etməkdən ötrü, onun dini ehtiyaclar və fəqir-füqəraya verilmək üçün ayrılan hissəsi. *Hər nə versən ver, məbada vermə bir dirhəm zəkat; Qoy acından ölsə, ölsün binəva kəndli və tat.* M.Ə.Sabir. *..Fəqirlərin haqqı olan zəkat pullarını yığan .. Hacı Məcid əfəndi deyilmi?* C.Məmmədquluzadə. // Klassik şeirdə: gözəlin mərhəmətinə, iltifatına, şəfqətinə işarə. *Qəmzə peykanın edər aşiqə çeşmin sədəqə; Öylə kim, mərdümi-muyim verə möhtacə zəkat.* Füzuli.

**ZƏKAVƏT** [*ər.*] bax **zəka**. *Nə əhlimizdə ayıqlıq əlaməti görünəydi; Nə bir para oxumuşlarda bu zəkavət olaydı!* M.Ə.Sabir. *İnsanda qabiliyyət də gərək olsun, zəkavət də gərək olsun, hamı oxuyan alim olmaz.* C.Məmmədquluzadə. *..Xəlilin zəkavəti, çapıqlığı, ayıqlığı Ağa Hüseyni təəccübə gətirdi.* Ə.Haqverdiyev.

**ZƏKAVƏTLİ** bax **zəkalı**.

**ZƏKAVƏTLİLİK** bax **zəkalılıq**.

**ZƏKİ** [*ər.*] bax **zəkalı**. [Şeyx Kəbir:] *Lakin ən son yerin, zəki Sənan! Olacaq son nəfəsdə Gürcüstan.* H.Cavid. *..Mən də xoşnudam ki, məmləkətdə belə zəki cavanlar tapılır.* C.Cabbarlı. *Ziba olduqca zəki, gözüaçıq bir zəmanə qızı idi.* S.Hüseyn. [Musanın nəvəsi] *məharətlidir, zəkidir, gözüaçıqdır, cəld və zirəkdir.* Qantəmir.

**ZƏKİLİK** bax **zəkalılıq**.

**ZƏQQƏTO** *sif.* Çox acı, zəqqum kimi. *Bu meyvə zəqqəto zəhərdir.* // Həddən artıq turş.

**ZƏQQƏTUN** bax **zəqqəto**.

**ZƏQQUM** *is.* [*ər.*] 1. Acı meyvəsi olan bir cins ağac; ağı ağacı. [Xortdan:] *Odabaşıdan xahiş etdim ki, zəqqum ağacını mənə göstərsin.* Ə.Haqverdiyev. // Bu ağacın meyvəsi.

2. *məc.* Çox acı şey haqqında. *Heyif oldu yarın şirin söhbəti; Zəhərə, zəqquma, ağıya döndü.* Molla Cümə. *Görürəm Muğanın, Milin havası; İndi acı deyil bir zəqqum kimi.* R.Rza.

◊ **Zəqqum! zəqqum yeyəsən!** – qarğış, söyüş mənasında. [Vəzir:] *Zəhirmar, zəqqum, sən mənə elə xörək yediribsən ki, bir ay da yeməsəm acmanam.* M.F.Axundzadə. **Zəqqum kimi** – zəhər kimi (çox acı). *Həyat bir zəqqum kimi; Görünürdü o xana.* S.Vurğun. [Xanpəri] *heç nə deyə bilmədi, cavab verəcəyi sözlər zəqqum kimi boğazına yığılıb xirtdəyinə tıxandı.* Ə.Vəliyev. **Sifətindən (üzündən) zəqqum yağmaq** – çox acıqlı, hirsli, qaşqabaqlı adam haqqında. *Gözünü kövşənə zilləyib həyatını torpağa bağlamış kəndlilərin sifətindən elə bil zəqqum yağır, zəhər ələnirdi.* Ə.Vəliyev.

**ZƏQQUMLAMAQ** *f.* 1. Zəqqum vermək, zəqqum yedirmək.

2. *vulq.* Yedirmək, doydurmaq (acıqla deyilir).

3. *məc.* Acılamaq, zəhərləmək.

**ZƏQQUMLANMAQ** *qayıd. vulq.* Yemək (acıqla deyilir). [Qurbanəli:] *Bir əppəkdənzaddan ver, zəqqumlanaq.* N.Nərimanov.

**ZƏLALƏT**[1] *is.* [*ər.*] 1. *klas.* Alçalma, alçaqlıq, həqarət, rəzalət, xarlıq. *Bu nə zəlalətdir?*

2. Zillət, əzab və əziyyət, çətinlik, möhnət. *Amma o millət ki, ümidini qılınca bağlayıb, həmişə zəlalətdə bulunubdur.* N.Nərimanov. [Dərvişin] *üzündə və gözlərində əziyyət nişanələri oynaşıb çox zəlalətlərə düçar olduğuna işarə verirdi...* A.Divanbəyoğlu. ☐ **Zəlalət çəkmək** – əziyyətlə, zillət içində yaşamaq, çətin dolanmaq, acı, ağır həyat keçirmək. **Zəlalətə düşmək** – zəlil olmaq, zillətə düşmək, bəd-bəxt olmaq. [Hacı Novruz:] *Belə zəlalətə düşməkdənsə biryolluq ölüb qurtarmaq məsləhətdir.* Ə.Haqverdiyev.

**ZƏLALƏT**[2] *is.* [*ər.*] *klas.* Doğru yoldan azma, düz yoldan sapma (çıxma); sapqınlıq. ☐ **Zəlalət əhli** *klas.* – doğru yoldan azmış adam. *Zəlalət əhli hər şeyi gec anlar, gec də hökm eylər; O kəs kim, doğru yolu fəhm edər, əhli-fəzilətdir.* M.Ə.Sabir.

**ZƏLAM** *is.* [*ər.*] *klas.* Qaranlıq, zülmət. *Sanki göydən yağırdı hüznü zəlam; Çulğayırdı cahan üzün zülmət.* C.Cabbarlı.

**ZƏLİ** *is.* 1. Şirin sularda yaşayan, heyvanların bədəninə yapışıb onların qanını sormaqla dolanan xırda qurd. ☐ **Zəli qoymaq (salmaq, yapışdırmaq, düzmək)** – təbabətdə: xəstə adamın korlanmış qanını sordurmaq üçün onun bədəninin müvafiq yerlərinə zəli qoymaq. *Molla Qasımın arvadı Zeynəb qarı da azarlılara zəli yapışdırmaqda böyük ixtisas sahibi olub.* S.S.Axundov.

2. *məc.* Başqasını amansızcasına istismar edən, soyan, var-yoxunu sorub çəkən adam haqqında. *Xalqın qanını zəli kimi sormaq. – Bu əmrdə hakimi-vilayətlər şəbihdilər zəlilərə ki, qan sorub şişdikdə sahibi oları sıxır, tamam sorduqları qanı qusurlar.* M.F.Axundzadə.

3. *məc.* Yapışdığı yerdən qopmayan, tutduğunu əldən buraxmayan şey və ya adam haqqında. *Lakin bir zəli dəyişməyir öz xislətini.* O.Sarıvəlli. ☐ **Zəli kimi yapışmaq** – 1) tutduğu yerdən bərk-bərk yapışıb buraxmamaq, yapışıb əl çəkməmək. *Qəmər atasının qulluğundan mürəxxəs olub, düz mənzilinə gəlib, genə də zəli kimi kitaba yapışdı.* (Nağıl); 2) təngə gətirmək, cana gətirmək. [Kərbəlayı Rəcəb:] *Peşman olursan dalandan kənara çıxırsan, zəli kimi yapışırlar.* N.Vəzirov.

**ZƏLİL** *sif.* [*ər.*] Zəlalətə düşmüş; yazıq, bədbəxt, həqir, fəqir, xar. *Mən indi hazıram, ömrüm bu dəm tamam olsun; Belə zəlil* (z.) *yaşamaq bir kərə haram olsun.* A.Səhhət. ☐ **Zəlil etmək** – pis günə qoymaq, bədbəxt etmək, xar etmək, alçaltmaq. *Demin ki, yarə edib Seyyidi zəmanə zəlil; Məbadə könlü yanə, könlümü xərab görüb.* S.Ə.Şirvani. [Şamama cadu:] *Allah heç kəsi zəlil eləməsin...* Ə.Haqverdiyev. **Zəlil olmaq** – bədbəxt olmaq, pis günə qalmaq, xar olmaq, alçalmaq. [Naçalnik:] *Sizin nəcabətinizə hərgiz layiq deyil ki, özünüzü bədnam edib ümənai-dövlətin nəzərində xar və zəlil olasınız.* M.F.Axundzadə. **Zəlil olsun!** – bəddua, qarğış nidası. *Olsun düşməniniz həmişə zəlil; Duaçıdır sizə hər yoxsul, əlil.* H.K.Sanılı.

**zəlil-zəlil** *zərf* Yazıq-yazıq, fağır-fağır.

**ZƏLİLANƏ** *zərf* [*ər.* zəlil və *fars.* ...anə] *klas.* Zəlil kimi, bədbəxtcəsinə, yazıq-yazıq. *Mənsur bu mərhəmətdən bir növ taqətə gəlib göz yaşı tökərək, bir sövti-zəlilanə ilə ahü naləyə başladı.* C.Cabbarlı.

**ZƏLİLLƏŞMƏ** "Zəlilləşmək"dən *f.is.*

**ZƏLİLLƏŞMƏK** *f.* Zəlil olmaq, xar olmaq, pis günə düşmək.

**ZƏLİLLİK** *is.* Zəlalətə düşmüş adamın halı; zəlalət, xarlıq, həqirlik, yazıqlıq, bədbəxtlik. *Şadlıq ilə saxladığın aşığı; Zəlilliklə* (z.) *imtahana çəkirsən.* Aşıq Ələsgər.

**ZƏLZƏLƏ** *is.* [*ər.*] Yer qabığının bəzi sahələrinin vulkanik və ya tektonik proseslər üzündən güclü titrəməsi; yer sarsıntısı. *Usta Zeynal yaşadığı şəhərdə tez-tez zəlzələ olardı.* S.S.Axundov. *Vaxtı ilə uzaq və amansız bir zəlzələ böyük və gözəl bir şəhəri yerlə yeksan etmişdi..* Ə.Məmmədxanlı.

◊ **Zəlzələ(yə) salmaq** – 1) sarsıtmaq, dəhşətə salmaq, vəlvələyə salmaq. *Kosa hələ çayın ortasına çatmamış, yuxarı tərəfdən yeri-yurdu zəlzələyə salan bir gurultu qopdu.* S.Rəhimov; 2) aləmi bir-birinə vurmaq, həyəcan salmaq, mərəkə qoparmaq.

**ZƏLZƏLƏLİ** *sif.* Tez-tez zəlzələ olan, zəlzələ baş verən; zəlzələyə məruz qalan. *Zəlzələli yerlər.*

**ZƏMANƏ** [*ər.*] 1. Dövr, zaman. *Səni mənə bəxş elədi zəmanə; Yaxşı olan nəsib olmaz yamanə.* M.V.Vidadi. [Heydər bəy:] *Pərvərdigara, bu necə əsrdir, bu necə zəmanədir? Nə at çapmağın qiyməti var, nə tüfəng atmağın hörməti var.* M.F.Axundzadə. *Bəhram da bir çoxları kimi öz zəmanəsinin oğlu idi.* Ə.Vəliyev.

2. İndiki zaman, hazırkı vaxt, müasir həyat. *Zəmanə adamı* (*uşağı*). *– Ziba olduqca zəki, gözüaçıq bir zəmanə qızı idi.* S.Hüseyn.

3. Bəxt, tale, fələk mənasında. *Zəmanə saldı əcəb möhlətü məlalə məni.* X.Natəvan. *Yazıq Ələsgərdən üz döndəribsən; Ya bəxt yatıb, ya zəmanə dönübdü.* Aşıq Ələsgər.

**ZƏMANƏT** *is.* [*ər.*] Zaminlik, zamin olma. [Əbdüləli bəy:] *Balaş, sizin təməs-sükün vaxtı dünən qurtarmışdır. Çünki mən zəmanət vermişəm.* C.Cabbarlı. ☐ **Zəmanət etmək** – zamin olmaq. [Vəzir:] *Mən də zəmanət edirəm.* Ə.Haqverdiyev. // Bir şəxs haqqında verilən yaxşı rəy. *Bu zəmanəti kim vermişdi? – Abbas karandaşla bir əlcə kağıza ərizəsini yazdı, üç nəfərdən zəmanət aldı.* Ə.Əbülhəsən.

**ZƏMANƏTÇİ** *is.* Zəmanət verən adam, zamin olan adam; zamin.

**ZƏMANƏTKAR** *is.* [*ər.* zəmanət və *fars.* ...kar] b a x **zaminkar**.

**ZƏMİ** *is.* [*fars.*] Əkin yeri, tarla. *Taxıl zəmisi. – Muğan səhraları bir tamaşadır; Buğda zəmiləri qoşa-qoşadır.* S.Vurğun. *Göz işlədikcə dərya kimi dalğalanan kolxoz zəmiləri artıq buğum bağlayırdı.* S.Rəhimov. *Səməd sünbüllənməmişdən yanıb qaralmış zəmilərə, uzaqdan görünən kimsəsiz tarlalara baxdıqca ürəyi sıxılırdı.* İ.Hüseynov.

**ZƏMİN** *is.* [*fars.*] 1. *klas.* Yer, torpaq. *Əhli-zəmanə qanına çox təşnədir, zəmin; Qanın kimin tökərsə fələk, ol zaman içər.* Füzuli. *Bəhri-silabtək zəminü zəman; Cünbuşə gəldi, qopdu bir tufan.* M.Ə.Sabir. □ **Ruyi-zəmin** *klas.* – yer üzü, dünya, aləm.

2. Üzərində şəkil, naxış salınan əsas rəng, ton, yer; fon.

3. *məc. kit.* Bir şeyin, hadisənin cərəyan etdiyi əsas şərait, mühit, vəziyyət, imkan. *İctimai zəmin. Məsələyə beynəlxalq hadisələr zəminində baxmaq lazımdır. – Hər bir fərdin istedadı kollektiv zəmində çiçəklənib meyvə verə bilər.* S.Rəhimov.

**ZƏMİNƏ** b a x **zəmin** 3-cü mənada. [Məsmə:] *Məni yuxu aparmırdı. Məruzəm üzərində çıxışda bulunan natiqlərə verəcəyim cavab üçün zəminə düşünürdüm.* S.Hüseyn. [S.Vurğun] *o zaman yazmış olduğu bir sıra şeirlərində möhkəm bir zəminədə durur.* O.Sarıvəlli. □ **Zəminə yaratmaq (hazırlamaq, qoymaq)** – lazımi şərait yaratmaq, hazırlamaq. *Danışıqlar üçün müvafiq zəminə yaratmaq* (*hazırlamaq*). *– Biz də bu gecə mühüm bir hadisənin zəminəsini qoymalıyıq.* M.S.Ordubadi.

**ZƏMİNƏSİZ** *sif.* Heç bir zəmini, əsası olmayan, əsassız, zəminədən məhrum.

**ZƏMİR** *is.* [*ər.*] *köhn.* Köhnə qrammatikada: əvəzliyin adı.

**ZƏMİSİÇANI** *is. zool.* Taxılların arasında yaşayıb, onlara ziyan verən gəmirici (siçan).

**ZƏMMƏ** *is.* [*ər.*] Ərəb əlifbasında "ü" saitini əvəz edən və hərfin üstündə qoyulan  işarəsinin adı; piş.

**ZƏM-ZƏM** *is.* [*ər.*] Məkkənin yanında olub, suyu dindar müsəlmanlar tərəfindən müqəddəs sayılan bir quyunun adı (klassik şeirdə təmizlik, paklıq, saflıq, duruluq rəmzi kimi işlənir). *Köysünə vuran həcər kimi daş; Zəm-zəm kimi gözdən axıdan yaş.* Füzuli. *Zəm-zəm tək oldu kuyinə əşki rəvan, rəvan; O, Kəbə içrə görmədi əhli-səfa, səfa.* S.Ə.Şirvani. *Çalxanır sonalar, çığrışır qazlar; Zəmzəm zümzüməli göllərin, dağlar!* Aşıq Ələsgər. □ **Abi-zəmzəm** – b a x **ab**.

**ZƏNBƏRƏK** *is.* [*fars.* "zənburək"dən] 1. Qədimdə: adətən dəvə üstündə gəzdirilən kiçik top. *Əlliyə qədər atlı yavaş-yavaş gəlirdi. Arxadakı dəvədə bir zənbərək topu da vardı.* Çəmənzəminli.

2. Metal yay.

**ZƏNBƏRƏKÇİ** *is. köhn.* Zənbərək atan, zənbərək topuna xidmət edən. *Birinci güllə zənbərəkçini aşırıb dəvədən saldı.* Çəmənzəminli.

**ZƏNBİL** *is.* [*ər.*] İçinə şey qoymaq üçün küləşdən, qarğıdan, çubuqdan və s.-dən hörülmüş qab. [Qız] *kanalın yaxınlığında zənbilini yerə buraxıb bir daş üstündə oturdu.* S.Hüseyn.

**zənbil-zənbil** *zərf* Zənbillər dolusu, zənbillərlə. *Ət bazardan daşınıb mənzilə zənbil-zənbil; Etmədi mədələri yağlı qidanı təhlil.* S.Ə.Şirvani.

**ZƏNBİLCİK** *is.* Kiçik zənbil, balaca zənbil.

**ZƏNBİLÇİ** *is.* Zənbil toxuyan və satan adam.

**ZƏNBİLÇİLİK** *is.* Zənbil toxuma və satma işi, zənbilçinin peşəsi. *Zənbilçiliklə məşğul olmaq.*

**ZƏNBİLLİ** *sif.* Əlində zənbili olan, zənbildə şey aparan. *Zənbilli qız.*

**ZƏNBUR** *is.* [*ər.*] *klas.* Arı, cır arı. *Bağrım şan-şan olur zənbur evi tək; Gözüm ki sən gəzən otağa düşər.* Q.Zakir. *Ələsgər, üsyanın çıxıbdı sandan; Öldürsən zənburu, əl çəkməz şandan.* Aşıq Ələsgər.

**ZƏNCƏFİL** *is.* [*ər.*] Köklərində efir yağları olan tropik bitki. // Bu bitkinin ədviyyə kimi işlənən kökü. [Hacı Mehdi:] *Qəndimi, çayımı, istiotumu, darçınımı, zəncəfilimi də satacağam.* M.S.Ordubadi. *Zəncəfil tropik bitki olub Asiya qitəsinin cənubunda bitir. Bəzi xörəklərin və undan hazırlanmış məmulatın tamını yaxşılaşdırmaq üçün istifadə edilir.* □ **Zəncəfil çayı** – zəncəfil kökündən hazırlanan çay. *Anası zəncəfil çayının hayındaydı.* Mir Cəlal.

**ZƏNCƏFİLLİ** *sif.* Zəncəfil səpilmiş, zəncəfil tökülmüş. *Zəncəfilli qoğal.*

**ZƏNCƏRƏ** *is.* [*fars.*] *zool.* Çəyirtkəyə bənzər qara rəngli böcək, iynəcə.

**ZƏNCİ** *is.* [*ər.*] Tropik Afrikanın, dərisi tünd-qara rəngdə olan yerli əhalisi və bu əhaliyə mənsub adam. *Afrika zənciləri. – Bunlar zəncilərdən və afrikalılardan ibarət idi.* M.S.Ordubadi. *Öz ana vətənində ağızdolusu gülər; Rəngi qara, qəlbi ağ zəncilər.* S.Rüstəm.

**ZƏNCİR** *is.* [*fars.*] 1. Bir-birinə keçmiş halqalardan ibarət dəmir bağ; silsilə. *Saat zənciri. Lövbər zənciri. İti zəncirlə bağlamaq. – Axırda Dəmirçioğlu atasından gizli bir canlı kotan zəncirini də götürüb toqqa əvəzinə belinə bağladı.* "Koroğlu". *Kəndlinin cavan oğlu şiddətli surətdə dəli oldu, hətta onu zəncir ilə bağlamağa məcbur olurlar.* S.S.Axundov.

2. Buxov, qandal. *Əzizim bağlı qaldı; Yar qəlbi dağlı qaldı; Zəncir, buxov görmədi; Qollarım bağlı qaldı.* (Bayatı). *Ruhi-Məcnuni sevirsən bir dəm ey zəncir açıl; Kim, tutulmuş şəhridən könlüm biyaban istərəm.* Qövsi. *..Dustaqxananın zəncir səsi camaatın qulağına gəldi.* Ə.Haqverdiyev. *Zənciri qolundan atdı bu torpaq.* B.Vahabzadə. ◻ **Zəncirə çəkmək (vurmaq)** – zəncirləmək, əl-ayağını zəncirlə bağlamaq. *Dili-divanəni zəncirə çəkərsən, yeri var; Ətri-zülfün nə üçün müşki-Xətadan seçməz?* S.Ə.Şirvani.

3. *məc.* Əsarət, zülm, məhkumluq rəmzi. *İnsanlara zəncir, fəğan gətirən; O, faşist adlanan qara itləri; Məhv et silahının qüdrətilə sən!* R.Rza. // Klassik şeirdə gözəlin zülfünə işarədir. *Tutmazam zənciri-zülfü tərkin, ey naseh; Məni xah bir aqil xəyal et, xah bir divanə tut.* Füzuli. *Saçın zəncirinə könül bağladım; Məcnun kimi düşdüm dağa, Fatimə!* M.P.Vaqif.

◊ **Zəncir kimi (tək)** – bir-birinin ardınca, silsilə şəklində. *Dağların ardı-arası kəsilmir, zəncir kimi bir-birinə hörülmüş, bir-birini qucaqlamış kimi durur.* A.Şaiq. *Zəncirtək düzülüb on beş hünərvər; Daşlı küdrüləri etdilər səngər.* H.K.Sanılı. **Zəncir gəmirmək (çeynəmək)** (bəzən "əlindən" sözü ilə) – birinə qarşı son dərəcə hiddətli olmaq, birinə divan tutmağa hazır olmaq, acıqlı olmaq. **Zəncirdən qurtarmaq** – b a x **zəncirini qırmaq** 1-ci mənada. *Yaşıllıq çağırsın hər qəlbin neyi; Qurtaraq zəncirdən Prometeyi!..* S.Vurğun. **Zəncirini qırmaq** – 1) əsarətdən qurtarmaq, azadlıq əldə etmək; 2) *məc. dan.* həddini azmaq, sözə baxmamaq, özbaşınalıq etmək.

**ZƏNCİRBƏND** *is.* [*fars.*] Zəncirlə bağlı, zəncirə vurulmuş, zəncirli.

**ZƏNCİRÇİ** *sif. köhn.* Məhərrəmlikdə, təziyə günlərində kürəklərinə zəncir vurmaqla özünə işgəncə verən mövhumatçı.

**ZƏNCİRÇİLİK** *is. köhn.* Məhərrəmlikdə, təziyə günlərində mövhumatçıların zəncirlə kürəyinə vurma adəti.

**ZƏNCİRƏ** *is.* 1. Sarı-qızılı rəngində incə haşiyə. *Dona zəncirə qoymaq. – Qırmızı çuxası, yaxa zəncirə; Ətəkləri uzun, sallanır yerə.* M.S.Ordubadi.

2. Zəncir, silsilə şəklində düzülmüş, zəncir kimi hörülmüş lentdən ibarət paltar bəzəyi, gül-çiçək hörgüsü. // Bu şəkildə ornament, bəzək.

**ZƏNCİRƏLİ** *sif.* Zəncirəsi olan. *Zəncirəli paltar. Zəncirəli başmaq.* – [Məşuqə] *zəncirəli tumanını dəstələyib .. həyətə enən pilləkənlə düşdü.* S.Rəhimov.

**ZƏNCİRLƏMƏ** 1. "Zəncirləmək"dən *f.is.*

2. *sif.* Zəncir kimi bir-birinə bağlı, silsilə kimi fasiləsiz.

3. *is. məc. dan.* Dəli. *Lap zəncirləmədir.*

**ZƏNCİRLƏMƏK** *f.* 1. Zəncir vurmaq, zəncirlə bağlamaq. *İti zəncirləmək. – Piri kişi qara köpəyi heç vaxt zəncirləmirdi.* S.S.Axundov.

2. *məc.* Boğmaq, hərəkət etməyə, fəaliyyət göstərməyə imkan verməmək. *Din və məzhəb yoxsulları zəncirləyib ağalara və sərvətdarlara qul etmək üçün yaradılmışdır.* S.S.Axundov. *Qanun var ki, zəncirləmiş ruhu, dili, həvəsi.* N.Rəfibəyli.

3. *məc.* Özünü bir işə və ya şeyə bağlamaq, əl-ayağını bağlamaq. [Aslanın] *bir fikri vardısa, o da qardaşını evləndirməkdi. Lakin Fərhad həmişə eyş-işrətdə olduğu üçün özünü hələ zəncirləmək istəməyib Aslanın sözlərini rədd edirdi.* C.Cabbarlı.

**ZƏNCİRLƏNMƏ** "Zəncirlənmək"dən *f.is.*

**ZƏNCİRLƏNMƏK** *məch.* 1. Zəncirlə bağlanmaq, zəncir vurulmaq; bağlanmaq. *Dar meydanda aslanın da zəncirlənər əl-ayağı.* S.Vurğun. *Yatdığı yerdən hürə-hürə sıçrayan, tut ağacı kölgəsində zəncirlənmiş* (f.sif.) *Alabaşa acıqlanıb, sonra da Şahbəy Sirata qışqırdı..* Ə.Əbülhəsən.

2. Zəncir kimi sıralanmaq, düzülmək. ◻ **Bir-birinə zəncirlənmək** – bir-birinə bağlanmaq, silsilə kimi düzülmək, sıralanmaq. *Yolun lap yuxarı səmtlərində isə bir-birinə zəncirlənmiş, uca və yaşıl dağlar vardı.* S.Rəhimov.

**ZƏNCİRLƏTMƏ** "Zəncirlətmək"dən *f.is.*

**ZƏNCİRLƏTMƏK** *icb.* Başqasına zəncirlə bağlatmaq, zəncir vurdurmaq.

**ZƏNCİRLİ** *sif.* 1. Zənciri olan. *Zəncirli saatlar, üstü almazlı; Toqqalar altunlu, qumro qotazlı.* H.K.Sanılı.

2. Zəncirlə bağlanmış, zəncir vurulmuş. *Zəncirli it.* // Əl-ayağında zəncir olan. *Zəncirli dustaq. – Sənin yaratdığın zəncirli qullar; Ağzını bir dəfə açıb gülmədi.* S.Vurğun.

3. *məc.* Əl-ayağı bağlı, əsir edilmiş, müti. *Zəncirlidir qoca qartal; Qanadları qəfəsdədir.* S.Vurğun.

4. *məc.* Dəli. *– Ağıllınız kimdir? – Qabaqda gedən zəncirli.* (Ata. sözü).

**ZƏNCİROTU** *is. bot.* Qırıldıqda içərisindən süd kimi maye ifraz edən qısa gövdəli, uzunsaplaqlı ot bitkisi. *Acıqovuq və ya zəncirotu cinsinin səbəti silindr şəkilli və ya zəngvaridir. Səbətdə çiçəklərin hamısı dilcik şəkillidir, sarı rənglidir.* H.Qədirov.

**ZƏNCİRVARİ** *sif.* Zəncir kimi; davamlı, sürəkli, silsiləli. *Zəncirvari reaksiya. Zəncirvari hörgü.*

**ZƏNCİRVURAN** *köhn.* bax **zəncirçi**.

**ZƏNDEYİ-ZƏHLƏ: zəndeyi-zəhləsi getmək** – tamam zəhləsi getmək, acığı gəlmək, görməyə gözü olmamaq. *Vəzirin Kəl Həsənnən zəndeyi-zəhləsi gedirdi.* (Nağıl); **zəndeyi-zəhləsini aparmaq** – tamam zəhləsini aparmaq, acığını tutdurmaq, hiddətlənməsinə səbəb olmaq.

**ZƏNƏX** *is.* [*fars.*] *klas.* Çənə, alt çənə. *Münəvvər üz, lalə zənəx, tər buxaq; Tamam bir yanadır, bir yana gözlər.* M.P.Vaqif.

**ZƏNƏXDAN** *is.* [*fars.*] *klas.* Çənədə, yaxud yanaqda çuxur. *Dal gərdəndən düşüb tutub dalı zülf; Xoş göstərir zənəxdanı, xalı zülf.* M.P.Vaqif. *Siyah tellər ağ buxağın yanına; Xırda tellər zənəxdanə düşübdür.* M.V.Vidadi. *Nə göyçək görünür üzündə xalın; Gülgəz zənəxdanın xala yaraşır.* Aşıq Ələsgər.

**ZƏNƏXDANLI** *sif.* Zənəxdanı olan, çənəsində və yaxud yanağında çuxuru olan. *Çoxdur ağ bədənli, büllur buxaqlı; Lalə zənəxdanlı, qönçə dodaqlı.* M.P.Vaqif.

**ZƏNƏN** *is.* [*fars.*] 1. Qadın, arvad. *Camaat yer eylədilər, zənənnər gəlib oturdular.* "Aşıq Ələsgər". ☐ **Zənən xeylağı** *evf.* – qadın, arvad. *Onda ki, şahi-şəhid İngilistanə təşrif aparmışdı, ingilis padşahı da o zaman bir zənən xeylağı idi.* M.S.Ordubadi.

2. Həyat yoldaşı, arvad. *Günlərin bir günündə genə də padşahın zənəni həmli olur.* (Nağıl).

**ZƏNƏNƏ** *sif.* [*fars.*] Qadınlara məxsus, qadınlara aid. *Zənənə ayaqqabı. – Sarı başmaq zənənə; Gözəl çoxdu, mənə nə? Qoy ilqar qənim olsun; İlk yarından dönənə.* (Bayatı). *Pəri xanım .. zənənə paltarını geydi.* (Nağıl).

◊ **Zənənə hamam** *dan.* – çox hay-küylü yer.

**ZƏNG** *is.* 1. Vurulduqda xüsusi səs çıxarmaq üçün içərisində metal dili olan, ağzıgen, kəsik konusşəkilli mis və ya mis ərintisindən qayrılmış alət. *Kilsə zəngi. Zəng səsi. Dəmiryol zəngi. Yanğın maşını zəngi. – Davamlı bir zəng səsindən sonra 3 nömrəli tramvay döngədən göründü.* Qantəmir. // Həmin alətin heyvanların boynundan asılan kiçik növü; zınqrov. *Düzlərdə yük heyvanlarının boynundan asılmış zənglərin ahəngsiz və qarmaqarışıq səsindən başqa bir şey eşidilmirdi.* M.S.Ordubadi.

2. Səs siqnalı vermək üçün metal cihaz. *Qapının zəngi. Elektrik zəngi. – Birdən qapının zəngi çalındı.* M.Hüseyn. *Sərhəng Səfai zəngi basıb .. Firidunu aparmağı əmr etdi.* M.İbrahimov. *Zəng səsi Kərim bəyi xəyalından ayırdı.* Mir Cəlal.

3. Bu alət vasitəsilə çıxarılan səs siqnalı. *Telefon zəngi. Saatın zəngi.* ☐ **Zəng vurmaq** – 1) zəngə bir şey vurmaqla, toxundurmaqla və ya elektrik zənginin düyməsini basmaqla səs siqnalı çıxarmaq. *Anisim tələsik pilləkəni başa çıxdı, zəngi vurdu.* S.Rəhimov; 2) zəngin səsi çıxmaq (bəzən "zəng vurulmaq" şəklində də işlənir). *Qapının zəngi vurdu. Telefon zəngi vurmaq. – Üçüncü zəng vurulurdu. Camaat tamaşa zalına axışırdı.* S.Rəhimov; 3) danışmaq üçün telefona çağırmaq, telefonda danışmaq. *Evlərinə zəng vurdu. Sizə zəng vurdum, cavab olmadı.* **Zəng eləmək (etmək)** – bax **zəng vurmaq** 3-cü mənada. *Usta divardan asılmış telefonla kimə isə zəng etdi.* M.Hüseyn. **Zəng çalmaq** – bax **zəng vurmaq** 1 və 2-ci mənalarda.

**ZƏNGÇALAN** bax **zəngçi**.

**ZƏNGÇİ** *is.* Vəzifəsi kilsə zəngini vurmaqdan ibarət olan kilsə xidmətçisi; zəngçalan.

**ZƏNGÇİÇƏYİ** *is. bot.* Zəngvari çiçəyi olan çiçək bitkisi. *Zəngçiçəyinin zərif, açıqçəhrayı yarpaqları olur.*

**ZƏNGÇİÇƏKLİLƏR** *cəm bot.* Bitişik, bəzi hallarda isə bölünmüş ləçəkləri olan bitkilər fəsiləsi.

**ZƏNGÇİLİK** *is.* Zəngçinin işi, vəzifəsi.

**ZƏNGƏL** *is. məh.* Çəkmə boğazını əvəz edən dəri və gön qunc; ketr.

**ZƏNGİ** [*fars.*] b a x **zənci**.

**ZƏNGİN** *sif.* 1. Çoxlu mal-dövləti, sərvəti, maddi vəsaiti olan, çox varlı. *Zəngin ölkə. – Bu kənd böyük, zəngin bir kənd idi.* N.Nərimanov. // Eyni mənada adam haqqında. *Heç zənn etməm özgənin mali; Bizi zəngin qılıb edə ali.* M.Ə.Sabir.

2. Çox bol, çoxlu, bollu, çox geniş. *Zəngin dil* (*söz ehtiyatı və ifadə vasitələri çox bol olan inkişaf etmiş dil*). *Zəngin kitabxana. Zəngin neft yataqları. Əsəri yazmaq üçün zəngin material toplanmışdır. Zəngin imkanlardan istifadə etmək.*

3. Çox qəşəng, çox gözəl, möhtəşəm, dəbdəbəli, təmtəraqlı, cah-calallı. *O yerdə ki quşlar oxur, söylənilən türkülər; Andırır ki, o torpağın zəngin təbiəti var.* S.Vurğun.

**ZƏNGİNLƏŞDİRİCİ** *sif.* 1. Zəngin edən, varlandıran, sərvəti artıran.

2. *xüs.* Süxuru zənginləşdirməyə xidmət edən. *Zənginləşdirici maddələr.*

**ZƏNGİNLƏŞDİRİLMƏ** "Zənginləşdirilmək"dən *f.is.*

**ZƏNGİNLƏŞDİRİLMƏK** *məch.* 1. Zəngin edilmək, daha da varlandırılmaq.

2 Artırılmaq, gücləndirilmək.

**ZƏNGİNLƏŞDİRMƏ** "Zənginləşdirmək"dən *f.is.*

**ZƏNGİNLƏŞDİRMƏK** *f.* 1. Zəngin etmək, varlandırmaq. *Ölkəni zənginləşdirmək.*

2. Daha da artırmaq, çoxaltmaq. *Öz təcrübəsini zənginləşdirmək. Biliyini zənginləşdirmək. – Ana dilində və farsca yazılmış əsərləri ilə Şəhriyar, .. təravətli obraz və ifadə vasitələri ilə zənginləşdirmiş, xüsusən dünya poeziyasına "Heydərbabaya salam" kimi yüksək dərəcədə xəlqi və sənətkarlıq baxımından nadir əsərlərdən birini töhfə vermişdir.* B.Nəbiyev.

3. *xüs.* Süxurun boşluğunu aradan qaldırmaqla, yaxud ona hər hansı bir maddə daxil etməklə, onun dəyərini, faydalılığını artırmaq. *Filizi zənginləşdirmək.*

**ZƏNGİNLƏŞMƏ** "Zənginləşmək"dən *f.is.*

**ZƏNGİNLƏŞMƏK** *f.* 1. Varlanmaq, varlı olmaq, malı, dövləti daha da artmaq.

2. *məc.* Biliyi, məlumatı artmaq; əqlən, mənən daha da inkişaf etmək; kamilləşmək. *Şiraslan öz-özünə cavab verdi: "Bəli, insan təbiəti dərk etməklə, onu dəyişdirməklə özü də zənginləşir".* S.Rəhimov. *İnsan mənəvi cəhətcə yalnız o zaman həqiqi mənada zənginləşə bilər ki, onun həyat idealı bütün başqa hissləri üzərində hakim olsun.* M.Hüseyn.

**ZƏNGİNLİK** *is.* 1. Varlılıq, dövlətlilik; böyük sərvətə, dövlətə, mal-mülkə, maddi vəsait və imkanlara malik olma. // Var, dövlət, sərvət, mal və mülk, maddi vəsait və pul bolluğu.

2. Həşəmət, calal, dəbdəbə, təmtəraq. *Bu qəsr Bağdad qəsrlərinin ən kiçiyi, lakin zinət və zənginlik cəhətcə ən böyüyüdür.* M.S.Ordubadi.

3. Adətən cəm şəklində – maddi vəsait, sərvətlər. *Azərbaycanın torpaqaltı zənginlikləri müxtəlif və tükənməzdir.*

**ZƏNGLİ** *sif.* Zəngi olan. *Gəminin zəngli saatı gecə saat 2-ni vururdu.*

**ZƏNGULƏ** *is.* [*fars.*] Azərbaycan klassik musiqisində: 12 əsas muğamdan biri. *Əsas muğam bunlar idi: üşşaq, nəva, .. zəngulə və hicaz.* Ü.Hacıbəyov. // Hər bir xanəndəyə xas olan iki qonşu tonun tez təkrarından əmələ gələn titrək səs. *Zəngulə ilə oxumaq. – Könüllər dillənir zənguləsində; Hər təzə havaya təzə söz seçir.* H.Hüseynzadə. ☐ **Zəngulə vurmaq** – oxuyarkən bu cür səslər çıxarmaq (xanəndənin oxumaq xüsusiyyəti). [Suraxanski:] *Hansı məşhur xanəndə, Qaryağdıoğlundan başlamış, mənim kimi zəngulə vura bilər?* Ə.Haqverdiyev. *Hətta* [Fərəc] *zəngulə vuranda uşaqlar bir-birinə baxıb dişlərini ağardırlardı.* Qantəmir. *O, sazın zil pərdəsini dilləndirir və o zamanın ən məşhur xanəndəsi olan Keçəçioğlunun zəngulələrini düzgün vurmağa çalışırdı.* A.Şaiq.

**ZƏNGŞƏKİLLİ** b a x **zəngvari**.

**ZƏNGVARİ** *sif.* Şəkilcə zəngə oxşayan, görünüşcə zəngə bənzəyən.

**ZƏNGVURAN** *is.* Zəng çalan adam, kilsədə zəng vuran şəxs; zəngçalan.

**ZƏNN** *is.* [*ər.*] 1. Kafi dəlil üzərində əsaslanmayan ehtimal, güman, qeyri-qəti fikir. *Qəzetin olmadı bu həftə əyan; Yüz yerə getdi zənnü fikrü güman.* S.Ə.Şirvani. *Mənim zənnim ayrı yerə getdi.* Mir Cəlal. ☐ **Zənn etmək (eləmək)** – güman etmək, ehtimal etmək, düşünmək. [Əhməd:] *Mən elə zənn edirdim ki, Gülnazın nazənin səsin eşitsəm bihuş olaram.* T.Ş.Simurq. [Bəhram Pəriyə:] *Mənim adımla özünü təsvir edirsən, zənn edirəm.* C.Cabbarlı. *Zənn etməyin o saçlar öz-özünə ağarmış.* H.Hüseynzadə. **Zənn ilə** – diqqətlə. *Qürbət bir şəhərin bazarında iki adam qabaq-qabağa gəlib bir-birinə zənn ilə baxdılar.* Çəmənzəminli. *Ağa sağ əlini çənəsinə dayadı, kirpiklərini bir dəfə də qırpmadan Tahirə zənn ilə baxdı.* M.Hüseyn. **Zənnim kəsmir** – güman etmirəm, inana bilmirəm, ağlım kəsmir. **Zənnimcə** – mənim fikrimə görə, fikrimcə, düşündüyümə görə, ehtimalıma görə. *Zənnimcə, o, doğru demir. Zənnimcə, bu gün soyuq olacaq.* – [Nadir bəy:] *Yalnız Çingizi, yaxud onun kimi bir-iki cahangiri haqsız görüb də, başqalarını haqlı göstərmək, zənnimcə, pək böyük bir haqsızlıqdır.* H.Cavid. [Xanım:] *Qısqanclıq yaxşıdır yerində; Hər şey üstə qısqanclığa meydan verməyin, zənnimcə, mənası yoxdur.* Çəmənzəminli. **Zənnini yayındırmaq** – çaşdırmaq, fikrini azdırmaq. *İlyas uzandığı yerdə sakitcə dayanıb düşmənin zənnini yayındırırdı.* Mir Cəlal.

2. Şübhə, şəkk, güman. *Zənnin kimə gedir? – Mümkün olsa lap kökündən qaldırıb bir zənn ilə; Cümlə mətbuatı viran etməli bundan sora.* M.Ə.Sabir. [Hacı:] *Mənim səndən zənnim var idi.* Ə.Haqverdiyev.

3. Yaddaş, hafizə. [Zülfüqar dedi:] *Zənnim korlanıb, sizi yaxşı tanıya bilmədim.* B.Bayramov.

**ZƏR**[1] *is.* [*fars.*] *klas.* 1. Qızıl. *Zər ilə olan zor ilə olmaz.* (Ata. sözü). *Ey mücəssəm duyğu, ey ülvi bəşər; Ey çamırlıq içrə düşmüş saf zər.* A.Səhhət. *Gözəlsən, tərifin düşüb mahala; Zər kəmər yaraşır qaməti-dala.* Aşıq Ələsgər. *Neçə məktəblərimiz var, neçə cəmiyyətimiz; Zərimiz, zivərimiz, qüvvətimiz, qüdrətimiz.* Ə.Nəzmi.

2. Qızıl suyu, yaxud qızılı toz. *Zər vurmaq. Zər kağız* (*üzərinə qızıl suyu çəkilmiş, yaxud qızıl tozu ilə örtülmüş kağız*). *Zər yazı* (*qızıl suyu ilə yazılmış yazı*). – *Bunu oxumusanmı? – deyə mizin üstünə atdığı sarı cildli, zər yazılı kitabı göstərdi.* M.Hüseyn. *Rəis zər paqonlu qaraşın bir oğlan idi.* Mir Cəlal. *Qoşqar sinəsi atlana-atlana daşların üstünə qaçar, .. zər kimi bərq vuran balıqları yığmağa başlardı.* İ.Hüseynov.

3. B a x **zərxara**. *Zər tuman, zər arxalıq; Yaşılı, həm alı göyçək.* Aşıq Ələsgər.

**ZƏR**[2] *is.* [*fars.*] Sümükdən və s.-dən qayrılan altıüzlü, üzərində xallar olan oyun daşı (əsasən nərd oyununda istifadə olunur). [Nüşabə:] *Söylə, kimsən, haradansan, ey gənc? Oynayırkən, zər atırsan şeş, pənc.* A.Şaiq. *Nərd yiyəsi sonra papiros qutusundan kağıza bükülü zərləri çıxardı.* Ə.Əbülhəsən.

**ZƏRAVƏND** *is.* [*fars.*] *bot.* Düz və sarmaşıq gövdəyə malik ot-bitki (kök və yarpaqlarında olan zəhərli maddələrdən təbabətdə istifadə olunur).

**ZƏRB** *is.* [*ər.*] 1. Vurma, vuruş, zərbə. *Zərbənin gücü, şiddəti. Ağac zərbi. – Zərb zəyərəkdən yağ çıxardar.* (Ata. sözü). *..El bir olsa, zərbi kərən sındırar..* Aşıq Abbas. *Vəzn, xüsusilə zərb ilə çalınan musiqi əsərlərində .. daha qabarıq surətdə nəzərə çarpır.* Ə.Bədəlbəyli. ☐ **Zərbə düşmək** – gücə düşmək, zora düşmək.

2. Adətən **zərbindən** şəklində – toxunma gücündən, şiddətindən, zərbəsindən, təsirindən. *Küləyin zərbindən ağaclar yıxıldı. – Zərbindən dağlar titrəşir; Bərqin dirəxşanı kimi.* Aşıq Ələsgər. *Mən hələ ondan qorxuram ki, Parijin yıxılmağının zərbindən özgə şəhərlər də bərbad ola.* M.F.Axundzadə. *Yəqin ki istinin zərbindən hərə bir kölgə yerə pənah gətirib.* C.Məmmədquluzadə. *Səlim sillənin zərbindən səndələdi.* M.İbrahimov.

3. **Zərblə** şəklində *zərf* – şiddətlə, bərk, bütün ağırlığı ilə. *Atılan qarmağın birini də balıq aparmışdı. .. Elə bu vaxt sudakı qarmağın zərblə dartıldığını gördülər.* İ.Şıxlı. *Oğlan əlindəki kağız bükülüsünü yerə çırpıb, qapını zərblə çəkdi.* İ.Məlikzadə.

4. *riyaz. köhn*. Vurma əməli. *Beş zərb beş – eylər iyirmi beş*. ☐ **Zərb cədvəli** – vurma cədvəli. *Əhmədin riyaziyyatdan çox da başı çıxmazdı, amma əmali-ərbəəni və ələlxüsus, zərb cədvəlini yaxşı bilirdi*.. B.Talıblı.

5. Metal pul, sikkə və s. üzərinə naxış, damğa vurma. ☐ **Zərb vurmaq (eləmək)** – metal pul kəsmək, sikkə kəsmək. **Zərb olunmaq (edilmək)** – kəsilmək (metal pul və s.).

**ZƏRBAF** *is*. [*fars*.] 1. Bafta, güləbətin, zərli parça toxuyan usta.

2. Qızıl və ya güləbətinlə qarışıq parça, habelə bu parçadan tikilmiş paltar. *Alaydım yaşmağın, açıb kəmərin; Çıxarıb əynindən zərbafın, zərin*. M.P.Vaqif. *Böyükxanım başında zərbaf çarşab .. salam verib daxil oldu*. M.S.Ordubadi. *Belinə yaraşıb zərbafdan kəmər; Çəpkənli, çarqatlı ağbədən gəlir*. Aşıq Abbas.

**ZƏRBAFLI** *sif*. Zərbafdan biçilmiş, zərbafdan tikilmiş; qızıl və ya güləbətinlə işlənmiş, zərlə sırmalı. *Tərifli gözəllər gəlhagəl oldu; Yaşıllı, zərbaflı, allı sənəm, gəl!* Xəstə Qasım.

**ZƏRBDƏST** *is*. [*ər*. zərb və *fars*. dəst] 1. Qol gücü, qüvvət. *Onun zərbdəstindən qolum ağrıdı*.

2. *məc*. Hünər, güc, bacarıq. *Tutub kəmərindən çalanda yerə; Mənim zərbdəstim bilə pəhləvan!* "Koroğlu".

**ZƏRBƏ** *is*. [*ər*.] 1. Qolaylayaraq bir şeylə şiddətlə vurma; vuruş. *Yumruq zərbəsi. Balta zərbəsi. Zərbə səsi*. ☐ **Zərbə endirmək (çalmaq, vurmaq)** – 1) bir şeylə bərk vurmaq. *Bizləri osmanlı, alman, rus gətirdi, heyrətə; Zərbə vurdu hər biri mümkün qədər hürriyyətə*. Ə.Qəmküsar. *Şaxtaçılar çalarkən zərbəsini dağlara; Radiodan yayıldı bu səda uzaqlara*. M.Rahim; 2) zərər vermək. [2-ci bənna:] *Haydı, quzum, kərpic at; Kərpic gətir, az su qat; Gecikmə, gəl, durma, gəl! İşə zərbə vurma, gəl*. H.Cavid. **Zərbə yemək** – vurulmaq, döyülmək, zərbəyə məruz qalmaq. *Gəldiyev nagahani zərbə yemiş adam kimi səndirlədi, özünü saxladı*. Mir Cəlal. // Bərk dəymə, şiddətlə çarpma. *Top gülləsinin zərbəsi. Dalğanın zərbəsi*.

2. Şiddətli həmlə, ansızın və qəti hücum. *Cinahdan vurulan zərbə. Gözlənilməz zərbə. Ansızın zərbələr düşməni sarsıtdı*. – *Faşistlər zərbəmizə dözməyib geriyə qaçdılar*. M.Hüseyn. // *məc*. Bir şeyin qabağını almaq, bir şeyi aradan qaldırmaq üçün görülən qəti tədbir, hərəkət. *Müharibə qızışdıranlara qəti zərbə vurmaq*.

3. *məc*. Ağır mənəvi və ya cismani sarsıntı. *Taleyin zərbələri. Oğlunun ölümü onun üçün ağır zərbə oldu. Xəstəlik onun səhhətinə ağır zərbə vurdu*. – *Əgər insan güclü məxluq olsaydı, ən ağır zərbələrə də dözərdi*.. M.Hüseyn.

◊ **Zərbə altına qoymaq** – təhlükə qarşısında qoymaq.

**ZƏRBƏÇİ** *sif. köhn*. Zərbəçiliklə əlaqədar olan; qabaqcıl. *Zərbəçi fəhlələr. Zərbəçi briqada*. // İs. mənasında. *İstehsalat zərbəçiləri. Zərbəçilər toplanışı*. – [Qurban Fatmanisəyə:] *..Sən də oxuyarsan, onlar kimi savadlanarsan, daha zərbəçiyə zurnaçı, udarnikə udernik deyib, xalqı özünə güldürməzsən*. Ə.Haqverdiyev.

**ZƏRBƏÇİLİK** *is*. Zərbəçilərin kütləvi hərəkatı.

**ZƏRBƏFT** *klas*. b a x **zərbaf** 2-ci mənada. *Yeri abı zərbəftdən ki, misl və bərabəri bu vaxtadək Lənkəranda görülməmiş ola*. M.F.Axundzadə.

**ZƏRBƏLİ**[1] *sif. mus*. Zərb ilə çalınan, vurmaqla çalınan. *Zərbəli musiqi aləti. Nağara zərbəli musiqi alətidir*.

**ZƏRBƏLİ**[2] *sif*. 1. B a x **zərbəçi**.

2. Çox mühüm və təxirəsalınmaz. *Zərbəli tapşırıq*.

**ZƏRBƏT** *is*. [*ər*. "zərbat"dan – zərbələr] *köhn*. Zərbə, yara. *Vurursan sineyi-mollaya zərbət zərbət üstündən*. Ə.Nəzmi.

**ZƏRBXANƏ** *is*. [*ər*. zərb və *fars*. ...xanə] Metal pul kəsilən yer, rəsmi müəssisə.

**ZƏRBİ-DƏST** b a x **zərbdəst**. [Əsgər bəy:] *Yaxşı, bir özgə dəfə rast gələndə zərbi-dəstini göstərərsən*.. M.F.Axundzadə.

**ZƏRBİ-MƏSƏL** *is*. [*ər*.] Məsəl kimi söylənilən məşhur söz, xalq ifadəsi, atalar sözü. [Hacı:] *Nə qədər timsal və zərbi-məsəllər eşitsəniz, uşaqlarınıza deyin, dəftərlərinə yazsınlar*. Qantəmir. ☐ **Zərbi-məsəl olmaq** – dillərdə məsəl kimi işlənmək. *Çarın bu mahir rüşvətxoru özünün həyasızlığı ilə Təbriz tacirlərinin arasında zərbi-məsəl olmuşdu*. M.S.Ordubadi.

**ZƏRBLİ** b a x **zərbəli**[1]. *Zərbli musiqi alətləri*.

**ZƏRBÜLMƏSƏL** [*ər.*] b a x **zərbi-məsəl**. *Hər zərbülməsəlin öz tarixi var; Yersiz söz deməyib bizim babalar!* H.Hüseynzadə.

**ZƏRD**[1] *sif.* [*fars.*] *klas.* Sarı. *Əşkimi, çöhreyi-zərdimi görüb meyl etməz; Mən eşitmişdim, edər simü zər insanı əziz.* Q.Zakir.

**ZƏRD**[2] *is.* Sarıköynəyin məhəlli adı.

**ZƏRDAB** *is.* [*fars.*] 1. Süd çürüdükdə, qatıq qaldıqda hasil olan sarı, quru, turştəhər maye, su.

2. *biol. tib.* Laxtalanmış qan və limfanın duru çöküntüsü (təbabətdə dərman və diaqnostik vasitə kimi istifadə olunur). *Difteriyaya qarşı zərdab. – Qanın maye zərdab hissəsində qida maddələri olur ki, bu maddələr qana həzm üzvlərindən keçir və bütün bədənə yayılır*. "Zoologiya".

3. Yaradan çıxan çirkli və irinli su.

**ZƏRDALI** *is.* [*fars.*] Sarı ərik, qaysı (ağacı və meyvəsi).

**ZƏRDƏ** *is. məh.* Yerkökü.

**ZƏRDƏPƏR** *is. zool.* İri üzgəcli balıq.

**ZƏRDÜŞTİ** *sif.* [*fars.* əfsanəvi şəxsiyyət olan Zərdüştün adından] Zərdüştlüyə aid, zərdüşt dininə mənsub olan; atəşpərəst. // İs. mənasında. *Xüsusilə mənim xoşuma gələn Tahirin zərdüştilərlə rəftarı hekayəsidir*. M.F.Axundzadə. [Kəbusey:] *Zərdüştilər yaradılışda ikilik olduğuna inanırlar*. Çəmənzəminli.

**ZƏRDÜŞTİLİK, ZƏRDÜŞTLÜK** *is.* Qədim Azərbaycan, İran və Orta Asiya xalqlarının dini (zərdüştlüyün ən səciyyəvi xüsusiyyəti dünyada iki qüvvənin – xeyir ilə şərin həmişə bir-biri ilə mübarizədə olduğu təsəvvürümdən ibarətdir).

**ZƏRƏDİN** *is. xüs.* Məftil və s.-ni kəsmək, habelə qızmış dəmiri tutmaq üçün kəlbətin.

**ZƏRƏFŞAN** *sif.* [*fars.*] *klas. şair.* Qızıl səpən, qızıl saçan. *Tamaşana gəlsin, Rum ilə Misir; Zərəfşan tellərin dörd yana əsir.* Aşıq Sərvinaz. *Min də desə dürri-zərəfşandı bu! Dur qaçaq, oğlum, baş-ayaq qandı bu!* M.Ə.Sabir. *Neçin afaqi sarmaz şöleyi-hüsni-zərəfşanı?* H.Cavid.

**ZƏRƏNDAZ** *is.* [*fars.*] *köhn.* Keçmişdə taxçalardan asılan iki qıçalı (şalvara bənzər) zərxara, güllü, xırda bürünc pullarla bəzəkli pərdə.

**ZƏRƏR** *is.* [*ər.*] Ziyan. *Bunun xeyri var ki, zərəri yoxdur; Gülməli insanlar həyatda çoxdur*. S.Vurğun. □ **Zərər çəkmək** – zərər etmək, maddi itki vermək, zərərə məruz qalmaq. [Kosaoğlu:] *Allah ömrünü uzun eləsin, Qurban qağa, sən olan yerdə adam zərər çəkərmi?* İ.Şıxlı. **Zərər dəymək** – ziyan çəkmək. **Zərər etmək** – alverdə qazanmaq istərkən itki vermək, maddi itkiyə məruz qalmaq. [Məmmədbağır] *Bakıdan apardığı fındığı, şabalıdı istədiyi qiymətə sata bilmədiyindən, zərər edirdi*. S.Hüseyn. **Zərər gətirmək** – b a x **zərər vermək**. *Mənim doğruluğum zərər gətirdi*. Q.Zakir. **Zərər görmək** – ziyan çəkmək. [Sultan:] *Sənin atan da, əmilərin də yersiz inadkarlıqdan həmişə zərər görüblər*. İ.Hüseynov. **Zərər vermək** – ziyan vermək, zərərli olmaq. *Yalan zərər verər daim insana; Yalançı bənzəyər məlun şeytana*. Şəhriyar. **Zərər verməz** – zərəri olmaz. *Gözümdə məskən et, xari-müjəmdən ehtiraz etmə; Güli-xəndanə sordum, xarə yar olmaq zərər verməz.* Füzuli. **Zərər vurmaq** – ziyan vurmaq, ziyan çəkməsinə səbəb olmaq. *Hərçənd bir çox mollalar təklikdə "sətr" in şəri olmadığını, məarif və tərəqqimizə zərər vurduğunu söyləyirdi, amma heç kəs meydana çıxıb aşkar deməyə cəsarət edəmiyordu.* "Hophopnamə". **Zərər yox** – zərəri yoxdur, eyib etməz, razıyam. [Nadir bəy Aşıq Sultana:] *Zərər yox, madam ki arzu edirlər, sazını al da gəl, fəqət çox gecikmə!* H.Cavid. **Zərərə düşmək** – 1) b a x **zərər çəkmək**; 2) məcburiyyət altında pul xərcləməyə məcbur olmaq. **Zərərə salmaq** – pul xərcləməyə məcbur etmək. [Aşıq Vəli:] *Adama ümid-nevid verib, yerindən eləyib, zərərə salıb, axırda sözünə əməl eləməyənə lənət!* N.Vəzirov. **Zərəri çatmaq** – zərəri dəymək. *De, görüm onların nədir səməri? Bəlkə də hər kəsə çatır zərəri.* M.Ə.Sabir. **Zərəri nədir** – zərəri yoxdur. **Zərərin yarısından qayıtmaq** – ziyan gətirə bilən bir işi davam etdirməyib yarımçıq qoymaq, başa çatdırmamaq. [İmran:] *Gəl mənə qulaq as, zərərin yarısından qayıt*. M.Hüseyn. **Nə zərəri var** – b a x **zərəri nədir**. [Məşədi İbad:] *Əlbəttə, nə*

*zərəri vardır, cavanlıq olmasın, pul olsun*. Ü.Hacıbəyov. // Maddi itki, xəsarət.

**ZƏRƏRDİDƏ** *sif.* [*ər.* zərər və *fars*. ...didə] Bir hadisə, fəlakət və s. nəticəsində zərər çəkmiş, ziyan görmüş, xəsarət görmüş. *Zərərdidə adam. Zərərdidə ölkə. – Malı gedənlər və zərərdidə* (z.) *olanlar qorxudan baş komandanın yanına şikayətə gedə bilmirdilər*. M.S.Ordubadi. // İs. mənasında. *Zərərdidələrə kömək. Daşqın zərərdidələri. – Yüzbaşının yasavulları küçələri dolanırdılar və zərərdidələri yoxlamaqda idilər*. C.Məmmədquluzadə. ☐ **Zərərdidə olmaq** – zərər çəkmək, ziyan görmək, xəsarətə uğramaq. *Əvvəla, təhlükə zamanlarında Məşədi Kazım ağanın maliyyə işləri zərərdidə olurdu.* M.S.Ordubadi.

**ZƏRƏRLİ** *sif.* 1. Zərəri toxuna bilən, zərər verən, ziyanlı, müzür. *Zərərli fikirlər. Zərərli həşərat. Papiros səhhət üçün zərərlidir*. – [Alp Arslan:] *Mən paytaxtı zərərli ünsürlərdən təmizlədiyim zaman, Qətibəni də oğlunun yanına, Rey şəhərinə göndərmişdim*. M.S.Ordubadi.

2. Maddi itkiyə, zərərə, ziyana səbəb olan, zərərlə nəticələnən. *Zərərli satış*.

**ZƏRƏRLİLİK** *is.* Zərərli şeyin xassəsi, keyfiyyəti.

**ZƏRƏRSİZ** *sif.* Zərəri toxunmayan, zərəri olmayan; ziyansız. *Zərərsiz dərman. Zərərsiz adam. – Şeyx, o bir möhtərəm, zərərsiz adam; Həm müsafir, qəribü aciz adam.* H.Cavid. *Molla Xəlil axırda bu fikrə gəlmişdi ki, müəllimlə dost olsun. Bu vasitə ilə onu özü üçün zərərsiz* (z.) *bir hala sala bilərdi*. S.Hüseyn.

**ZƏRƏRSİZLƏŞDİRİLMƏ** "Zərərsizləşdirilmək"dən *f.is.*

**ZƏRƏRSİZLƏŞDİRİLMƏK** *məc*. Zərərsiz hala salınmaq. *Torpaq vasitəsilə, ən birinci olaraq, yanğın qonşu evlər üçün zərərsizləşdirilirdi.* Ə.Əbülhəsən.

**ZƏRƏRSİZLƏŞDİRİLMİŞ** *f.sif.* Zərərsiz hala gətirilmiş. *Zərərsizləşdirilmiş mina*.

**ZƏRƏRSİZLƏŞDİRMƏ** "Zərərsizləşdirmək"dən *f.is.*

**ZƏRƏRSİZLƏŞDİRMƏK** *f.* Zərərsiz hala gətirmək, zərər vermək imkanından məhrum etmək. *İstehkamçılar minaları tapıb zərərsizləşdirdikcə, minaların qaytanlarını doğradıqca elə bil qaranlıq gecə haraya isə qaçmaq istəyirdi*. Ə.Vəliyev.

**ZƏRƏRSİZLƏŞMƏ** "Zərərsizləşmək"dən *f.is.*

**ZƏRƏRSİZLƏŞMƏK** *f.* Zərərsiz hala düşmək.

**ZƏRƏRSİZLİK** *is.* Zərərsiz şeyin halı, xassəsi.

**ZƏRƏRVERİCİ** *is.* Kənd, meşə, anbar təsərrüfatına, habelə məişətdə insanlara zərər verən həşərat, heyvan. *Pambıq zərərvericiləri.* // Sif. mənasında. *Zərərverici cücülər. Zərərverici həşərat.*

**ZƏRF¹** *is.* [*ər.*] 1. İçərisinə məktub və ya başqa kağız qoyub başqa yerə göndərmək üçün xüsusi biçimli kağız qab; konvert, paket. *Molla Fərzəli məktubu yazıb bitirdikdən sonra büküb zərf içinə qoydu*. A.Şaiq. *Bu dəfə Zəfər stolunun dalından çıxıb əlində zərf mənə tərəf gəldi.* M.Hüseyn. *Ağabala zərfi açmamışdan Davud tərəfindən göndərildiyini bilirdi*. Mir Cəlal.

2. *köhn*. İçinə şey qoymaq üçün müxtəlif formalı qab; futlyar. *Saat zərfi.*

**ZƏRF²** *is.* [*ər.*] *qram*. Hərəkətin, keyfiyyətin və ya xassənin əlamətini bildirən dəyişməz nitq hissəsi. *Zaman zərfi. Yer zərfi.*

**ZƏRFİNDƏ** *zərf* İçində, ərzində, müddətində. *Beş gün zərfində. Bir ay zərfində. – Az bir müddət zərfində savadlanmağın birinci vasitəsi əlifbanın asanlığıdır.* M.F.Axundzadə. *Elm və nuri-mərifət ilə az vaxtın zərfində çox hünərlər meydana gətirmək olar..* F.Köçərli. *Yarım saat zərfində bu adamlar tələbələrin arasından bu surətlə kənara atıldılar, özləri də məbhut qaldılar.* T.Ş.Simurq.

**ZƏRFLİK** *is. qram*. İş və hərəkətin yerini, zamanını, kəmiyyətini, tərzini, səbəb və məqsədini bildirən cümlə üzvü.

**ZƏRGƏR** *sif.* [*fars.*] Qızıldan, gümüşdən bəzək şeyləri qayıran usta. *Zər qədrini zərgər bilər*. (Ata. sözü). *..Xədicə beş il əvvəl bəzək şeyləri satan zəngin bir zərgərə ərə getmişdir..* S.Hüseyn. *Bakıda ümumiyyətlə peşəkarlar: xalçaçı, zərgər, papaqçı, saatsaz, minasaz, dəllək, boyaqçı və sairə çox olardı.* H.Sarabski.

**ZƏRGƏRLİK** *is.* Zərgərin işi, sənəti, ixtisası. *Zərgərlik etmək. – Zərgər onlara öz bacardığı saatsazlıq, başmaqçılıq, zərgərlik sənətlərini öyrədirdi.* M.S.Ordubadi.

**ZƏRXARA** *is.* Zərli ipəkdən toxunmuş parlaq və şax ipək parça. *Zərxaradan libası; Gey, sallan, olma ası; Məni yandırdı, yaxdı; Gözlərinin qarası.* (Bayatı). [Bədircahan:] *Hesab elə, qeyri qız olsa, o səndən istəyəcək: yaxşı yemək, içmək, zərxaradan çərkəzi tuman.* N.Vəzirov. [Sara xanımın] *..zərxara arxalığı, qara məxmərdən tumanı, ..nəyi, nəyi yox idi?* Qantəmir.

**ZƏRXARALAMAQ** *f. köhn.* Zərxaradan pərdə çəkmək, pərdə asmaq.

**ZƏRXARALANMAQ** *məch. köhn.* Zərxaradan pərdə çəkilmək, pərdə asılmaq.

**ZƏRXARALI** *sif.* Zərxara, zərxarası olan. *Zərxaralı don. – Alagöz geyindiyi zərxaralı paltarda özünü qaratikan içinə düşmüş kimi hiss edərək boğula-boğula soruşdu: – Yəni müsəlman zənəni də şərab içərmi, xanım.* S.Rəhimov.

**ZƏRİF** *sif.* [*ər.*] 1. İncə. *Zərif çiçəklər. Zərif əl. Zərif yun.* – [Əbdüləli bəy:] *Qadın vücudu zərif* (z.) *yaranmışdır, odur ki, qədimlərdə qadınlar gəcavə ilə gəzirdilər.* C.Cabbarlı. *Varlığın nə zərif* (z.) *yarandı sənin; Gözlə görünməyən bir aləmin var.* S.Vurğun. *Məktubu oxuyarkən əlindən çıxardığı zərif yun əlcəkləri paltosunun cibinə soxdu.* Ə.Əbülhəsən.

2. *məc.* Nazik, incə. *Zərif söz. – Xoş gəlib şahə ol zərif kəlam; Ona şəmşirin eylədi ənam.* S.Ə.Şirvani. // Lətafətli, ürəyəyatan, qəşəng. *Zərif səs. – Sitarənin xəyalında bir cavan oğlanın əksi nəqş bağlamışdı. Bu oğlan Sitarə kimi zərif, lətif bir cavan idi.* Çəmənzəminli.

3. Arıq, zəif, cansız. [Rəhim bəy] *..naçalniklər yanında xidmət etmiş şirindil, zərif, gödəkboylu, altmış sinnini ötmüş bir kişi idi.* Ə.Haqverdiyev.

**ZƏRİFANƏ** *zərf* [*ər.* zərif və *fars.* ...anə] İncəliklə: gözəl, incə əda ilə, zərif, incə. *Zərifanə rəftar. Zərifanə söz.*

**ZƏRİFLƏŞDİRİLMƏ** "Zərifləşdirilmək"-dən *f.is.*

**ZƏRİFLƏŞDİRİLMƏK** *məc.* Zərif hala salınmaq; incələşdirilmək.

**ZƏRİFLƏŞDİRMƏ** "Zərifləşdirmək"dən *f.is.*

**ZƏRİFLƏŞDİRMƏK** *f.* Zərif hala salmaq; incələşdirmək.

**ZƏRİFLƏŞMƏ** "Zərifləşmək"dən *f.is.*

**ZƏRİFLƏŞMƏK** *f.* Zərif olmaq; nazikləşmək, incələşmək.

**ZƏRİFLİK** *is.* 1. İncəlik, lətafət, gözəllik, qəşənglik. *Xüsusən Səbanın səsində və söhbətindəki zəriflik Atabəyin o gözəl qadını Qətibədə yox idi.* M.S.Ordubadi.

2. Zəiflik. *Doğrudur, zərifliyin adı başqadır; Qüvvətə gəl, qüvvətin dadı başqadır.* M.Müşfiq.

**ZƏRİFYUNLU** *sif.* Zərif yunu olan, yununun incəliyi ilə fərqlənən. *Zərifyunlu qoyun.*

**ZƏRİNC** b a x **ziriş(k)**.

**ZƏRİNƏ** *is.* [*fars.*] Zərli, qiymətli paltar, qızıl bəzək. *..Xalxallı cariyələr və zərinələrə bürünmüş kənizlər Azərbaycan heyətinə xidmət edirdi.* M.S.Ordubadi.

**ZƏRQANADLI** *sif.* Sarı rəngli qanadı olan; sarıqanadlı. [Toxumyeyən] *cücü qara rəngli, zərqanadlı, xırda həşəratdır.*

**ZƏRLİ** 1. *sif.* Zərlə bəzəkli, zərlə işlənmiş, üzərinə zər çəkilmiş, zərlə örtülmüş. *Zərli parça. Zərli kağız. Zərli cild. – Dağdan gəldik ikimiz; Zərli yorğan yükümüz.* (Bayatı). *Taxçalarda xırda və zərli sandıqlar qoyulub, üstünə örtük çəkilmişdi.* M.S.Ordubadi. *Sövkəndi üzlərə zərli paqonlar; Şişdi tuluq kimi ağ nazik donlar.* H.K.Sanılı.

2. *is.* Zərli parça, zərlə işlənmiş parça.

**ZƏRLİLİK** *is.* Zərli şeyin xassəsi, keyfiyyəti.

**ZƏRLİ-ZİBALI** b a x **zər-zibalı**. [Gəray ağa:] *Niyə* [Müqim] *öz zərli-zibalı Zərişinlə .. Cavanşirlə Şuşa qalasını su yoluna döndərirsən?* S.Rəhimov. *Zərli-zibalı bir otaq qayırmışdılar.* S.Rəhman.

**ZƏRNİGAR** *is.* [*fars.*] *klas.* Qızıl naxışlı, qızılla bəzənmiş (naxışlanmış). *Tök cəmizərnigarə şəfəqgun bədəni; Hicrü fəraq şəminə yəni çirağ tut.* Q.Zakir. *Alişan imarət, aynabənd otaq; Zərnigar qəsrlər, eyvan mənimdir.* Aşıq Məhəmməd. *Danışırsan azğınazğın; Hanı qəsri-zərnigarın?* M.Ə.Sabir.

**ZƏRNİŞAN** [*fars.*] 1. *sif.* Qızıl suyu ilə vurulmuş nişanı (naxışı) olan, qızıl nişanlı. *Hərami könlümə tapşırdı zərnişan oxlar; Ki hər birisi dəyər padşah xəzinəsinə.* Qövsi. *Bir qoç igid bir meydanda tapılsa; Bəzənər o meydan, zərnişan olu.* "Koroğlu". *Olub zərnişan tacla sərfəraz; Şəbistanə qoydu qədəm yari-naz.* M.Ə.Sabir.

2. *is.* Zərli, bəzəkli, naxışlı parça və bu parçadan tikilmiş paltar. *Ağ xələt bürünər, zərnişan geyməz; Heç kəsi dindirib keyfinə dəyməz.* Aşıq Ələsgər. // Zər. [Qoca çoban Qumruya dedi:] *Onun şəklini elə toxu ki, nə qardan, çovğundan, nə də yüz il keçəndən sonra vurduğun naxışların zərnişanı solmasın...* Ə.Məmmədxanlı.

3. *sif.* Ümumiyyətlə bəzəkli. *Yaşıl nimtənəli, gülgəz qəbalı; Başında dəstarı zərnişan Pəri!* Aşıq Əmrah.

**ZƏRRƏ** *is.* [*ər.*] Bir şeyin ən kiçik hissəsi. [Qəhrəman:] *Kənarda şiddətlə əsən qış ruzgarı birqat pəncərələri yumruqlayır, kiçik qar və buz zərrələri ilə bombardman edirdi.* H.Nəzərli. *Buradakı dağ günəşinin tərkibində olan zərrələr .. misilsiz dərmanlardır.* S.Rəhimov. *Hər zərrəsi ulduz kimi; Gur bulaqdan sular axdı.* M.Dilbazi. ☐ **Zərrə qədər (də), bir zərrə qədər** – b a x **bir zərrə**. *Mehrin könüldə zərrə qədər bir zavalı yox.* S.Ə.Şirvani. *Tahir qızın gecikməyindən zərrə qədər də incimirdi.* M.Hüseyn. [Sultan:] *Sənin o quru qəfəsənin altında vətənə heç zərrə qədər də məhəbbət yoxdur, Məcid.* İ.Hüseynov. **Bir zərrə** – 1) bir az, çox cüzi miqdar. *Bir zərrə su içdim. Bir zərrə ondan ver. – Qızın dodaqlarında və üzündə bir zərrə də olsa qırmızılıq qalmamışdı.* M.S.Ordubadi; 2) qətiyyən, heç, əsla. *Yox böylə ikidilli, yamanüzlü cəfakar; Bir zərrə utanmaz!* M.Ə.Sabir. [Xəyyam:] *Yox, oxşayacaq ruhumu bir zərrə səadət; İzlər məni hər dürlü fəlakət.* H.Cavid.

**zərrə-zərrə** *zərf* Zərrələrlə, çox kiçicik hissələrlə, az-az, cüzi-cüzi.

**ZƏRRƏBİN** *is.* [*ər.* zərrə və *fars.* ...bin] Böyüdücü şüşə (ən xırda şeyləri böyük göstərən şüşə); mikroskop. *..Bir daşın qəlbində gizlənən brilyantı zərrəbin vasitəsilə görmək mümkündür.* M.S.Ordubadi. *Bu, zərrəbinlə oxunacaq dərəcədə xırda, zərif bir xətt ilə cığara kağızına yazılmış bir məktub idi.* M.Rzaquluzadə.

**ZƏRRƏCƏ** *zərf* Zərrə qədər də olsa, az da olmuş olsa; heç, əsla, qətiyyən. *Zərrəcə qorxusu yoxdur. – Gərçi, ey dil, yar üçün üz verdi yüz möhnət sana; Zərrəcə qəti-məhəbbət etmədin, əhsən sana.* Füzuli. *Uzun illər sənə qaldım mən həsrət; Zərrəcə görmədim mehrü məhəbbət.* M.P.Vaqif. *Amma mən zərrəcə darılmaz idim; O qaranlıqda heç də qorxmaz idim.* A.Səhhət.

**ZƏRRƏCİK** *is.* Ən kiçik zərrə; zərrənin ən kiçicik, ən xırda hissəciyi.

**ZƏRRƏDİN** *is. məh.* Balaca şeyləri tutmaq və ya kəsmək, doğramaq üçün kəlbətin.

**ZƏRRƏLƏNMƏ** "Zərrələnmək"dən *f.is.*

**ZƏRRƏLƏNMƏK** *f.* Zərrələr halına düşmək, ən xırda hissələrinə ayrılmaq, parçalanmaq.

**ZƏRRƏLƏNMİŞ** *f.sif.* Zərrələr halına düşmüş, ən xırda hissələrinə ayrılmış, parçalanmış.

**ZƏRRİN** *sif.* [*fars.*] 1. *klas.* Qızıldan düzəldilmiş, qızıldan qayrılmış. *Dev Reyhanı bir zərrin taxt üzərində qoyub, üzərinə gülab səpib burnuna müşkü ənbər iyi verdikdə Reyhan huşa gəlib, özünü devlərin yanında gördü.* (Nağıl). *Dövrü bir bəzmdir behiştibərin; Tac zərrin, sürahi həm zərrin.* Füzuli. // Zərli. *Bəzək bilməz bu diyarın göyçəyi; Tanımaz al çarqat, zərrin ləçəyi.* M.P.Vaqif. *İlhamımın yelkəni zərrin saçın olaydı.* M.Müşfiq. *Hər fikir mülkündə zərrin tac yatır; Hər meyvə tumunda bir ağac yatır.* O.Sarıvəlli.

2. *şair.* Qızıl kimi, qızıl rəngində, qızıl kimi parlaq. *Zərrin qədəh. Zərrin şəfəqlər. Zərrin şüalar. – ..Qərbdəki ulduzlar zərrin dumanlar içində itmiş, şərqdəkilər sanki qorxub bir-birinə qısılmışdı.* Ə.Məmmədxanlı. *Miz üstündə yanır bir şam titrədikcə şölələri; Səpib zərrin tellərini o bəzəyir nurla yeri.* B.Vahabzadə.

**ZƏRRİNƏ** b a x **zərinə**.

**ZƏRURƏT** *is.* [*ər.*] 1. Bir işə hər halda və vəziyyətdə məcbur olma, istər-istəməz onu əmələ gətirmə; məcburiyyət, naçarlıq, çarəsizlik. *Hər dəm çəkib ol qəm içrə min ah; Səbr etdi zərurət ilə ol mah.* Füzuli. *Zərurət üz verdiyi zaman, insan özündə adi vaxtlarda mövcud olduğunu əsla təxmin etməyən bir qüvvənin bulunduğunu hiss edə bilərmiş.* M.S.Ordubadi.

2. Lazım olma, lüzum, vaciblik. *Cəmiyyətin bütün mütərəqqi adamları .. qüvvələrini birləşdirmək zərurətini anlamışlar.* M.İbrahimov.

3. Ehtiyac, lüzum. *Seyyid, qəzəldə ləfziqəliz etmə mündəric; Kim kəşfinə zərurət ola*

"*Kənz*" *ya* "*Sihah*". S.Ə.Şirvani. *Əlbəttə, bu yerləri yazın ilıq günlərində görmək Qəhrəman üçün daxili bir zərurət idi.* S.Rəhimov. ◻ **Zərurət düşmək** – ehtiyac əmələ gəlmək, lazım gəlmək, yeri gəlmək. *Sərfəsizdir gövhəri israfilə sərf eyləmək; Ta zərurət düşməyincə söyləmək zinhar söz*. Qövsi.

4. Son dərəcə yoxsulluq, möhtaclıq, ehtiyac.

**ZƏRURİ** [*ər.*] 1. *sif.* Ən lazımlı, ən vacib, çox lazım, onsuz keçinilməsi mümkün olmayan. *Zəruri vəsait. Zəruri ehtiyac tədbirləri. İnsanın həyatı üçün zəruri olan qidalar.*

2. *zərf* Labüd, istər-istəməz olacaq, məcburi, mütləq. *Hər zərreyi-zahirin zühuri; Bir özgəyə bağlıdır zəruri*. Füzuli.

**ZƏRURİLİK** *is.* 1. Zəruri olma, vaciblik, lazımlıq, lüzum. *Nizam və qaydanın zəruriliyi*.

2. Labüdlük, məcburilik.

**ZƏRURİYYƏT** b a x **zərurət**. *Muxtarov Dadaş pulemyotçu idisə də, axır günlər zəruriyyət üzündən hesablama bölməsinə komanda edirdi.* Ə.Əbülhəsən. *..Daxili bir zəruriyyət* [Sultanı] *başı kəlağayılı qızlar dəstəsinə diqqət yetirməyə məcbur edirdi.* İ.Hüseynov.

**ZƏRVARİ** *sif.* Qızıl rəngində olan, sarıya çalan.

**ZƏRVƏRƏQ** *is.* [*fars*. zər və *ər*. vərəq] Üzünə qızıl suyu çəkilmiş kağız, zər ilə qaplanmış səhifə.

**ZƏRZƏR** *is.* [*fars*.] Zərlə toxunmuş parça, zərli parça. *Otağın divarlarındakı cüməxatanda böyük sandıqların üstə ipək, zərzər üzlü əlvan yorğan-döşəklər qoyulardı*. H.Sarabski.

**ZƏR-ZƏRBAFTA** *is.* [*fars*.] b a x **zərbaf** 2-ci mənada.

**ZƏR-ZİBA** *is.* [*fars*.] 1. Bərli-bəzəkli paltar, bahalı parça. *Qızıldan çarpazı, yar düymələri; Əyninə geyib zər-zibaları.* "Əmrah". *Gümüşüm tunc olub, zər-zibam da bez; Qəlb çıxır aldığım mal, qoca baxtım.* Aşıq Ələsgər. *Bayram gəlib, hamı geyib zər-ziba; Bizdə nə bez qədək, nə şal da yoxdur.* Aşıq Hüseyn.

2. Qızıl-gümüş, cavahirat, dövlət, qiymətli şeylər. [Koroğlu dedi:] *Şəhərin yerində kotan əkərəm; Zər-zibasın Çənlibelə çəkərəm.* "Koroğlu".

**ZƏR-ZİBALI** *sif.* Bərli-bəzəkli, süslü; bərli-bəzəkli paltar geymiş. *Ələmdar .. ağasının zər-zibalı xanımını gözləri qabağına gətirib maya kimi ağappaq əndamına baxır, baxır, baxırdı.* S.Rəhimov.

**ZƏR-ZİVƏR** *is.* [*fars*.] Bərbəzək, zinət, süs, yaraşıq. *Qapılar, divarlar gövhərdir, ipək; Verir libaslara zər-zivər, bəzək*. Şəhriyar.

**ZƏVAL** b a x **zaval**. *Bir gün olmaz kim, ona gərdün yetirməz bir zəval*. Füzuli. *Mehrin könüldə zərrə qədər bir zəvalı yox.* S.Ə.Şirvani. *Ey dövlətimin zəvalı oğlum! Ey başı ağır, bəlalı oğlum*. M.Ə.Sabir.

**ZƏVAT** [*ər.* "zat" söz. cəmi] b a x **zat**. *Yetdi necə bəs mövqei-ikmalə bu sənət? Etdi iki sərvətli zəvat ilə şərakət.* M.Ə.Sabir.

**ZƏVƏRDƏR** *is.* [*fars.*] *xüs. məh.* Bina tikilərkən qapı və pəncərənin üstünə qoyulan böyük daş.

**ZƏVVAR** *is.* [*ər.*] Ziyarət edən, ziyarətə gələn və yaxud ziyarətdən qayıdan şəxs; ziyarətçi. *Zəvvarın həmişə getmək ya gəlmək sədasını eşidən kimi Məhəmmədhəsən əminin gözündən yaş çeşmə kimi başlar axmağa*. C.Məmmədquluzadə. *Haşım yol ilə gedərkən iki nəfər nabələd adama rast gəldi. Bunların biri piyada zəvvar, biri də dərviş idi.* B.Talıblı. *Zəvvarlar karvanı Məkkə şəhərinə yaxınlaşır.* Ə.Məmmədxanlı. // Poetik dildə, məc. mənada. *Bulunmaz dünyada bənzərin bəlkə; Zəvvarın olmuşdur bir böyük ölkə.* Ə.Cavad. *Zəvvarın olmuşdur ay da, ulduz da; Göydəki mələk də, yerdəki qız da.* S.Vurğun.

**ZƏVZƏK** *sif.* Çoxdanışan, naqqal, boşboğaz, lağlağı. *Zəvzək adam*. // İs. mənasında. [Aslan bəy:] *Yox,* [doktor] *hələ gəlməmiş, ..o da hər zəvzək ilə vaxt keçirir*. A.Şaiq. *Bu inamla yaşamışam; Bizim kimi zəvzəklərin; İgidliyi dözüm olsun;* "*Heyvərəlik, boşboğazlıq*" *bizim olsun.* B.Vahabzadə.

**zəvzək-zəvzək** *zərf* Boş-boş, bihudə, mənasız. [Molla Abbas:] *Necə nağıl de? Nə zəvzək-zəvzək danışırsan. Mən vaizəm, yoxsa nağılçıyam ki, sizə nağıl deyəm*. C.Məmmədquluzadə.

**ZƏVZƏKLƏŞMƏ** "Zəvzəkləşmək"dən *f.is.*

**ZƏVZƏKLƏŞMƏK** *f.* Zəvzək olmaq, lağlağı olmaq.

**ZƏVZƏKLİK** *is.* Çox danışqanlıq, lağlağılıq, boşboğazlıq, naqqallıq. [Xan:] *Bivecdir, əlindən zəvzəklikdən başqa bir şey gəlməz.* Çəmənzəminli. *Yaman qəzəbləndi bu zəvzəkliyə; Baş həkim Cahangir çıxdı özündən.* B.Vahabzadə. □ **Zəvzəklik etmək** – boşboğazlıq etmək, naqqallıq etmək, boş-boş danışmaq. *Sabah bu arvad gedib orda-burda zəvzəklik edərək Siratın dövlətli tərəfdarı olduğunu danışa bilərdi.* Ə.Əbülhəsən.

**ZƏVZƏMƏ** "Zəvzəmək"dən *f.is.*

**ZƏVZƏMƏK** *f.* Çox danışmaq, naqqallıq etmək, boşboğazlıq etmək.

**ZƏVZƏTMƏK** *icb.* Zəvzəməsinə səbəb olmaq, çox danışdırmaq (boş-boş).

**ZƏY** *is. kim.* İkiqat sulfat turşuları kristallarından ibarət daş.

**ZƏYDAN** *is.* [zəy və *fars.* ...dan] Lampanın boğazına zəylə yapışdırılan və lampanın odluğu – maşını burulub keçirilən yivli halqa. *Lampanın zəydanı qopub.*

**ZƏYƏRƏK** *is. bot.* Toxumundan və dənindən yağ çıxarılan bəzir adlanan bitki; kətan. *Kətan* (*zəyərək*) *.. cinsinin Azərbaycanda 13 növü vardır.* Ə.Qasımov.

**ZƏYLƏMƏ** "Zəyləmək"dən *f.is.*

**ZƏYLƏMƏK** *f.* Zəy vurmaq, zəy qarışdırmaq, zəy qatmaq. *Suyu zəyləmək* (*durulmaq üçün suya zəy vurmaq*).

**ZƏYLƏNMƏ** "Zəylənmək"dən *f.is.*

**ZƏYLƏNMƏK** *məch.* Zəy vurulmaq, zəy qarışdırılmaq, zəy qatılmaq.

**ZƏYLƏTMƏ** "Zəylətmək"dən *f.is.*

**ZƏYLƏTMƏK** *icb.* Başqasına zəylətdirmək. *Suyu zəylətmək* (*durulmaq üçün suya zəy vurdurmaq*).

**ZƏYLİ** *sif.* Zəy ilə qarışıq olan, zəy vurulmuş, zəy qatılmış. *Zəyli su. – İnsanın bədəni yanmaqdan, məsələn, qaynar su tökməkdən qabarıb ziyadə azar edər.. Belə qabarı duzlu, ya zəyli suya salanda qabarın içindəki su bu duzlu sudan duru olduğuna dəridən keçib duzlu suya qarışır və bu səbəbə belə qabarı yarım saata sağaltmaq olur..* "Əkinçi".

**ZƏYLİK** b a x **zəydan**. *Lampanın zəyliyi əyilmişdir.*

**ZIĞ** *is.* 1. Duru (sulu) palçıq, lehmə, bataq. *Qurşağacan batıb zığa; Əlləşir misirli qardaşlar.* O.Sarıvəlli. *Pilpilənin təpəsindən bozumtul zığ və lehmə axırdı.* M.Süleymanov. *..Zığdan addım atmaq qeyri-mümkün olmuşdu.* İ.Hüseynov.

2. Gözdə əmələ gələn çirk, kir.

3. Yağ, yağlılıq, qatılıq, qəlizlik.

4. Yaş peyin töküntüsü.

◊ **Zığ vermək (vurmaq)** – ağzınacan dolu olmaq. *Böyük həyatin o biri başı toydan dağılışan adamla zığ verirdi.* Ə.Əbülhəsən.

**ZIĞBAZIĞ** *zərf dan.* Ağzınacan, ağzına qədər. *Otaq zığbazığ dolu idi.*

**ZIĞILDAMA** "Zığıldamaq"dan *f.is.*

**ZIĞILDAMAQ** *f. dan.* İnildəmək, mızıldamaq, şikayətlənmək.

**ZIĞILDAŞMA** "Zığıldaşmaq"dan *f.is.*

**ZIĞILDAŞMAQ** *qarş.* Zığıldamaq (çoxları yerbəyerdən). *Titrəməyin, haydı, zığıldaşmayın! Ay cücələr, çox da cırıldaşmayın.* Ə.Nəzmi.

**ZIĞILDATMA** "Zığıldatmaq"dan *f.is.*

**ZIĞILDATMAQ** *icb. dan.* Zığıldamağa məcbur etmək, zığıldamasına səbəb olmaq.

**ZIĞLAMAQ** *f.* Palçıqlamaq, palçığa batırmaq, lehmələmək, lehməyə bulamaq. *O su təmiz bir yolu korlayıb zığlamasa yaxşıdır.* S.Rəhimov.

**ZIĞLANDIRMA** "Zığlandırmaq"dan *f.is.*

**ZIĞLANDIRMAQ** *f.* 1. B a x **zığlamaq**.

2. Qatılaşdırmaq, qatılığını artırmaq. *İnək südünü zığlandırdı.*

**ZIĞLANMA** "Zığlanmaq"dan *f.is.*

**ZIĞLANMAQ** *f.* Zığa (palçığa) bulanmaq, batmaq.

**ZIĞLANMIŞ** *f.sif.* Zığa (palçığa) batmış, lehmələnmiş. *Zığlanmış döşəmə.*

**ZIĞLAŞMA** "Zığlaşmaq"dan *f.is.*

**ZIĞLAŞMAQ** *f.* Zığ halına gəlmək, zığ olmaq, lehmələnmək.

**ZIĞLATMA** "Zığlatmaq"dan *f.is.*

**ZIĞLATMAQ** b a x **zığlamaq**.

**ZIĞLI** *sif.* 1. Palçıqlı, lehməli, bataq, bataqlıq. *Küçə zığlı idi,* [Nemətullayev] *yeridikcə sürüşürdü.* S.Rəhimov. *Zığlı dərəciklər quruyub yaşıllaşırdı.* M.İbrahimov.

2. Qatı, qəliz. *Bu qoyun yaxşı zığlı süd verir.*

3. Kirli, çirkli. *Kaştan keçəlləmiş quyruğunu bulaya-bulaya yarıyumulu zığlı gözlərini teştə zilləmişdi.* İ.Məlikzadə.

**ZIĞLIQ** *is.* 1. Zığ olan yer; palçıqlıq, lehməlik, bataqlıq.

2. Qatılıq, qəlizlik.

**ZIĞ-ZIMĞIR** b a x **zığ** 1-ci mənada. *Qolqılçasını çırmayıb işə girişən uşaqlar bu bağçanın qumlu torpağına, arxın zığ-zımğırına batıb bulanmaqdan çəkinmirdilər*. S.Rəhimov.

**ZIQQANMA** "Zıqqanmaq"dan *f.is.*

**ZIQQANMAQ** *f.* Gücənmək, gücə düşmək, hıqqanmaq. // Bir işi çox çətinliklə görmək. *İdarədəkilər Müsyö Qomel ilə birlikdə hələ də o kəlmənin üstündə zıqqanırdılar*. Qantəmir.

**zıqqana-zıqqana** *zərf* Gücənə-gücənə, hıqqana-hıqqana, gücə düşərək, güclə, çətinliklə. *Belə yerdə zıqqana-zıqqana kağız oxumaq çox ayıb olacaqdı.* Qantəmir. *Bəy zıqqana-zıqqana ağır gövdəsini yerdən üzdü, dərhal yekə döşəkçəyə çırpdı*. Mir Cəlal.

**ZIQQI** *sif.* və *is.* 1. Çox xəsis, çox tamahkar, acgöz. *Xalıqverdiyə görə Mirzə Cəmil çox xəsis, göy, zıqqı adamdı*. Ə.Vəliyev.

2. Ağırxasiyyətli, zəhlətökən, zəhləaparan. *Elə bir zıqqıdır ki, dindirəsi deyil*.

**ZIQQILDAMA** "Zıqqıldamaq"dan *f.is.*

**ZIQQILDAMAQ** *f.* Zarımaq, inildəmək, sızıldamaq, zarıldamaq. *Kosa qocalıb əldən düşmüş xəstə qarı kimi zıqqıldadı*. S.Rəhimov. *..Məmmədhüseynin arxası yerə dəyəndə çox yemiş ayı kimi zıqqıldadı və qışqırdı.* Mir Cəlal.

**ZIQQILTI** *is.* Zıqqıldama səsi, inilti, zarıltı.

**ZIQQINMAQ** b a x **zıqqanmaq**.

**zıqqına-zıqqına** b a x **zıqqana-zıqqana**. *Bir uşaq da mollanın qabağında diz çöküb, zıqqına-zıqqına dərs oxuyurdu*. P.Makulu.

**ZILĞA** *is. məh*. 1. Quşun yeni yumurtadan çıxmış tüksüz balası; ətcəbala. *Gözünün önündə qara, boz ilan; Girib yuvasına, edərdi talan; Körpə balaları udardı diri; Qalmazdı salamat zılğanın biri*. H.K.Sanılı. *Onun dişsiz ağzı zılğa cücə kimi açıldı.* S.Rəhimov.

2. Quraqlıqdan sıxıntı çəkib incəlmiş. *Zılğa taxıl* (*bitki*).

3. Çox zəif, tək-tük tükləri olan. *Onun başının tükləri təpədən yanlara qədər tökülmüş, ortası zılğa* (z.) *qalmışdı*. S.Rəhimov.

**ZILX** *is. məh*. Çuğundur.

**ZILXA** *zərf məh.* Tamamilə, bütün, başdan-başa, sələt. *Bu ət zılxa yağdır.*

**ZILIQ** *is. məh.* Gözdən, ağızdan, burundan axan selik.

◊ **Gözünün zılığını axıtmaq** – b a x **göz**. [Hacı Atakişi Tamaşaya:] *Nə olub, yenə gözünün zılığını axıdırsan?* Ə.Abasov.

**ZILIQLI** *sif. məh*. Zılığı olan, zılıq axan.

**ZIMIRTLAQ** *is. məh*. Zığ, bataqlıq yer; yaş peyin tökülmüş yer.

**ZINBA** *is.* Deşik açmaq üçün əl aləti; deşikaçan.

**ZINDIQ** *is.* [*ər.*] Əsil mənası zərdüşti (kafir, dinsiz) olub, canlı dildə söyüş məqamında işlənir. [Əhməd:] *..Bu zındıq oğlu zındıqdır ki, ondan bir tük də çəkmək olmayır.* N.Vəzirov.

**ZINQ**[1] *is.* Quş ifrazatı, quş təzəyi. *Toyuq zınq atdı.*

**ZINQ**[2], **ZINQ-ZINQ** *təql.* Zəngin, qumrovun çıxardığı səs.

**ZINQILDAMA** "Zınqıldamaq"dan *f.is.*

**ZINQILDAMAQ** *f.* İncə zəng səsi çıxarmaq. *Qumrov zınqıldadı. – Ağatlı fayton tərpəndi, zınqıldaya-zınqıldaya* (z.) *səs saldı.* S.Rəhimov.

**ZINQILDATMA** "Zınqıldatmaq"dan *f.is.*

**ZINQILDATMAQ** b a x **zanqıldatmaq**.

**ZINQILTI** *is.* Zəngin çıxardığı səs, incə zəng səsi. *Eşitdilər birdən yeni zınqıltı; Faytonçular çox bərk qovurdu atı.* H.K.Sanılı. *Telefon zınqıltısı növbətçi həkim otağını doldurdu*. S.Rəhimov.

**ZINQIROV** *is.* Heyvanların boynuna, dəfin sağanağına taxılan xırda zəng, qumrov. *Tək çalınan zınqırovlar uzun-uzun guvuldar; Usandıran bir səs ilə vıyıldar.* A.Səhhət. *Yeridikcə dəvələr səslənən zınqırovlar; Əruzun ahəngini xatırladır şairə*. B.Vahabzadə.

**ZINQIROVLU** *sif.* Zınqırov asılmış, zınqırovu olan. *Zınqırovlu keçi. Zınqırovlu dəvə. Zınqırovlu dəf. – Budur iki fayton gəlir, ikisi də zınqırovlu.* C.Məmmədquluzadə. *Çoxdan bəri zınqırovlu fayton görməmiş uşaqlar, ..məktəbin yanından uzanan araba yolu ilə aşağıya sarı yüyürdülər*. M.Hüseyn.

**ZINQIROVOTU** *bot.* b a x **zəngçiçəyi**.

**ZIPPILTI** *is. dan.* Bir şey yuxarıdan düşdükdə, yaxud bir yerə dəydikdə çıxan səs.

**ZIRAN** *is.* Oyunda axırıncı; uduzmuş partnyor.

**ZIRI(Q)** *sif.* və *is. vulq*. 1. Çox yekə və yöndəmsiz, yekəpər.

2. Qanmaz, anlamaz, qaba, kobud adam.

**ZIRILDAMA** "Zırıldamaq"dan *f.is.*

**ZIRILDAMAQ** *f. dan.* Zır-zır etmək, usandırıcı bir səslə ağlamaq. [Səməd bacısına:] *Ay arvad, bu xalqı nə zinhara gətirdin? Sənə demədimmi çox zarıldayıb zırıldama?* B.Talıblı. // *məc*. Xoşa gəlməyən bir səslə ağlarcasına oxumaq. *Uşaq qırıq val kimi zırıldayırdı*. Mir Cəlal.

**ZIRILDATMA** "Zırıldatmaq"dan *f.is.*

**ZIRILDATMAQ** *icb. dan*. Zırıldamağa məcbur etmək, zırıldamasına (ağlamasına) səbəb olmaq; ağlatmaq.

**ZIRILTI** *is. dan*. 1. Zırıldama, zır-zır ağlama. *Zırıltı səsi*.

2. Səs-küy, mərəkə, həngamə, dava-qalmaqal, dava-dalaş, araqarışma. *Zırıltı qopmaq. – Mən də çıxıb bir yana gedərəm, beləliklə də, bu zırıltı yatıb qurtarar.* M.S.Ordubadi. *Həpirin yəqini idi ki, bu zırıltıdan sonra atası onun evində qalmaz, baş götürüb gedər.* Mir Cəlal. [Qarı:] *Bu zırıltı nədir, deyirlər hökumət dəyişilib?* Ə.Əbülhəsən.

◊ **Zırıltı ilə** – biabırçılıqla, rüsvayçılıqla.

**ZIRINQ** *təql.* Zəngin çıxardığı səs.

**ZIRINQAZIRINQ** *zərf* Zınqıldaya-zınqıldaya, zəng kimi zınqıldayaraq, səs sala-sala. *..Fayton .. zırınqazırınqla hərəkət edirdi.* S.Rəhimov.

**ZIRINPA** *is. məh*. Zır-zır ağlama, zırıldama. *..Cəfərə baxıb Yusif də onun kimi başladı zırınpanı*. C.Məmmədquluzadə.

**ZIRNI, ZIRNIX** *is.* [*ər.* zirniq] Bədəndə olan artıq tükləri aparmaq üçün işlədilən maddə (arsenlə kükürd xəlitəsi).

**ZIRPI** *sif.* və *is. vulq*. 1. Çox yekə, çox böyük, yekəpər, yöndəmsizcəsinə iri. *Şah Dəşküvar baxırdı, gördü ki, bu pəlvan elə zırpı pəlvandı ki, qabağında dağ dayanmaz.* (Nağıl). [Gileygüzarov:] *Mən boyda zırpı ədibi burada qoyub, bir gör kimləri çap eyləyirlər, kimləri?! – deyib özündən çıxdı*. S.Rüstəm. *..Bitdilidən zəvvar aparmağa gələn zırpı bir şeydi.* Ə.Əbülhəsən.

2. B a x **zırı(q)** 2-ci mənada.

**ZIRPILAŞMA** "Zırpılaşmaq"dan *f.is.*

**ZIRPILAŞMAQ** *f. vulq*. Çox yekələşmək, çox qabalaşmaq, yöndəmsizcəsinə iriləşmək.

**ZIRPILIQ** *is. vulq.* Yöndəmsizcə yekəlik, irilik, böyüklük, yekəpərlik. *Zırpılığına baxma, gücü yoxdur.*

**ZIRPILTI** b a x **zıppıltı**.

**ZIRRAMA** *is.* və *sif.* Gic, sarsaq, ağıldan kəm; sözünü, hərəkətini bilməyən, zırı. *Axırından şey çıxmadı, zırramanın biri idi.* R.Rza. *Nə qədər ki, bu zırramanın əlində imkan var, çalış, ondan istifadə et, özün isə gözdəqulaqda ol*. İ.Əfəndiyev.

**ZIRYAN** *is.* Komi xalqının köhnə adı.

**ZIR-ZIR** 1. *təql. dan.* Usandırıcı uşaq ağlaması səsi. □ **Zır-zır eləmək** – bax **zır-zır zırıldamaq**. **Zır-zır zırıldamaq** – zırıltı ilə ağlamaq; daim ağlamaq.

2. *sif.* Ağlayan. *Zır-zır uşaq.*

**ZIVINCA** *is. məh*. Qolsuz isti qadın tənliyi (candonusu). *Qumrunun anasından bir yadigar var idi: məxmər zıvınca.* Mir Cəlal.

**ZİBA** *sif.* [*fars.*] *klas*. 1. Bəzəkli, zinətli, yaraşıqlı, qəşəng. *Ziba nimtənəli, tikmə köynəkli; Gözləri qəmzəli, qallı sənəm, gəl!* Xəstə Qasım.

2. Gözəl, göyçək. *Surəti ziba sənəmlər yox demən bütxanədə; Var çox, əmma sənə bənzər büti-xunxar yox.* Füzuli. *Anın üçün uymaz qeyriyə könlüm; Bir əcəb zibadır mənim sevdiyim*. M.P.Vaqif. *Könlümdə o ziba sənəmin şövqi-vüsalı; Etmişdi pərişan saçıtək fikrü xəyalı*. A.Səhhət.

**ZİBALANMAQ** *f.* Gözəlləşmək, qəşəngləşmək, daha da gözəl və qəşəng olmaq. *Ala gözlər nərgisi-məstanə tək şəhlalənir; Elə ki süzgünləşir, yüz mərtəbə zibalənir.* M.P.Vaqif.

**ZİBALIQ** *is.* Gözəllik, yaraşıqlılıq, qəşənglik. *Səni bu zibalıqda; Görməyən göz gözdümü?* Sarı Aşıq. *Mələkdə belə hüsn olmaz, pəridə belə zibalıq; Nə gülşəndə gülü lalə, nə gərdundə məhü əxtər*. Aciz.

**ZİBƏS** *zərf* [*fars.*] *klas*. (bəzən "ki" bağlayıcısı ilə). Kifayət qədər, qədərincə. *Zibəs ki müntəzirəm ayaq sədasından; Təsəvvür eyləyirəm, bəlkə nazlı yar gəlir*. S.Ə.Şirvani. *Zibəs çoxdan bəri şövqündə idim mən bu həlvanın; Dedim, yaran, nolur versən bana bir payi-hürriyyət.* M.Ə.Sabir.

**ZİBİL** *is.* 1. Evlərdə, küçələrdə və s.-də yığılaraq onları zibilləndirən tör-töküntü, tullantı. *Evin zibilini süpürüb atmaq. – Bizim Cəfərin anası ev-eşiyi süpürüb, yığılan zibili evin qabağına atırdı...* C.Məmmədquluzadə. *O gündən hamamın qapısı mismarlandı, qabağına zibil tökülməyə başlandı.* Çəmənzəminli. // *məc. dan*. Lüzumsuz, yararsız, heç

bir qiyməti, dəyəri olmayan şey haqqında. *Bu zibili buradan götürün*.

2. *məc*. Çox pis, yaramaz, murdar, alçaq, rəzil adam haqqında (bəzən söyüş mənasında). *Zibilin biri zibil*. // *məc*. Yararsız, ləyaqətsiz, aciz, bacarıqsız adam haqqında. [Molla:] *Amma öz aramızdı, heç cavanlıqda da bir zibil deyildim.* "M.N.lətif."

◊ **Zibil kimi** – həddən artıq çox, bol (bəzən həddən artıq çox olduğu üçün qiymətdən düşmüş şey haqqında). *İndi pul zibil kimi, fəqət həvəs yox. Qüvvət gedib.* N.Nərimanov. **Zibili çıxmaq** – həddindən artıq çoxaldığı üçün qiymətdən düşmüş, əhəmiyyətini itirmiş, gözdən düşmüş şey haqqında.

**ZİBİLATAN** *is. xüs*. Yığılmış zibili kənar etmək üçün qurğu, mexanizm və s.; zibildaşıyan.

**ZİBİLÇİ** *is.* Həyətlərin, küçələrin zibilini maşın və ya araba ilə daşıyıb aparan işçi.

**ZİBİLÇİLİK** *is.* Zibilçinin işi, peşəsi.

**ZİBİLDAŞIYAN** *sif.* Həyətlərdə, küçələrdə yığılmış zibili daşıyıb aparan. *Zibildaşıyan maşın*.

**ZİBİLXANA** bax **zibillik**.

**ZİBİLLƏMƏ** "Zibilləmək"dən *f.is.*

**ZİBİLLƏMƏK** *f.* 1. Zibil etmək, zibil tökmək, zibilləndirmək. *Xalçanın üstünü zibilləmək. Döşəməni zibilləmək. – Ədə, Həsənəli, naxır gəlir, qaç töylənin qapısını aç, heyvanlar gəlib həyətə girməsinlər və həyət-bacanı zibilləməsinlər.* C.Məmmədquluzadə.

2. *məc*. Xarab etmək, korlamaq, lüzumsuz, istənilməz və s. şeylərlə doldurmaq. *Dili lüzumsuz yad sözlərlə zibilləmək.*

**ZİBİLLƏNDİRİLMƏ** "Zibilləndirilmək"-dən *f.is.*

**ZİBİLLƏNDİRİLMƏK** "Zibilləmək"dən *məch.*

**ZİBİLLƏNDİRMƏ** "Zibilləndirmək"dən *f.is.*

**ZİBİLLƏNDİRMƏK** bax **zibilləmək**.

**ZİBİLLƏNMƏ** "Zibillənmək"dən *f.is.*

**ZİBİLLƏNMƏK** *f.* 1. Zibilli olmaq, zibilə batmaq, bir şeyin içində çoxlu zibil yığılmaq. *Həyət lap zibillənibdir. Hovuz yaman zibillənib.*

2. İçərisinə bir şey düşmək nəticəsində xarab olmaq, korlanmaq, tutulmaq. *Su borusu zibillənmişdir*.

**ZİBİLLƏŞDİRMƏ** "Zibilləşdirmək"dən *f.is.*

**ZİBİLLƏŞDİRMƏK** *f.* 1. Zibil tökmək, zibilli etmək.

2. *məc*. Korlamaq, xarab etmək, pozmaq.

**ZİBİLLƏŞMƏ** "Zibilləşmək"dən *f.is.*

**ZİBİLLƏŞMƏK** *f.* 1. Zibilli olmaq, zibilə dönmək.

2. *məc.* Xarab olmaq, korlanmaq.

**ZİBİLLƏTMƏ** "Zibillətmək"dən *f.is.*

**ZİBİLLƏTMƏK** bax **zibilləmək** 1-ci mənada.

**ZİBİLLİ** *sif.* 1. Zibil olan, süpürülməmiş, zibildən təmizlənməmiş. *Zibilli otaq. Zibilli küçə*.

2. İçərisində yararsız, zərərli kənar şey olan. *Zibilli buğda. Zibilli düyü. Zibilli pambıq*.

**ZİBİLLİK** *is.* Zibil tökülən yer; zibilxana. *Zibili zibilliyə tökmək. – Vəziri qarğa olanın ağzı zibillikdə gərək*. (Ata. sözü).

◊ **Zibilliyə atmaq** *məc*. – lüzumsuz, yaramaz bir şey kimi rədd etmək, atmaq, yaddan çıxarmaq, unutmaq. *Tarix çox atmışdır zibilliklərə; Döyüş meydanında satılanları.* S.Vurğun.

**ZİBİLLİLİK** *is.* Zibilli yerin halı.

**ZİBİLSİZ** *sif.* Zibilli olmayan, zibildən təmizlənmiş; arıdılmış, təmiz. *Zibilsiz dən.*

**ZİBİLSİZLİK** *is.* Zibilsiz şeyin halı və keyfiyyəti; təmizlik, xalislik.

**ZİDD** [*ər.*] *sif.* Tamamilə başqasına əks olan, onunla qətiyyən düz gəlməyən. *Zidd fikir. Zidd rəy söyləmək. Əsərdə iki zidd qüvvə üz-üzə qoyulur*. // *is.* Bir şeyin əksi, qarşılığı, müxalifi. *Şirin acının ziddidir. – Gözləmək və səbir etmək* [sevginin] *təbiətinə zidd imiş*. Ə.Sadıq. ☐ **Zidd çıxmaq** – 1) əleyhinə (əksinə) çıxmaq, əleyhinə (ziddinə) hərəkət etmək. *Təbiətin bu gözəl ahəngdar qanununa zidd çıxmaq olmaz*. S.Rəhimov; 2) müvafiq olmamaq, əks olmaq. *Bu faktlar bir-birinə zidd çıxır*. **Zidd getmək** – əleyhinə çıxmaq, əksini demək, qarşı durmaq, müxalif olmaq. *Zeynəb öz təbiətinə zidd gedə bilmədi*. İ.Şıxlı.

**ZİDDİNƏ** *zərf* Əksinə, qarşı, əleyhinə. *Bir şeyin ziddinə hərəkət etmək. – Ziddimə söz deyən olsaydı, edərdim təkfir; İşimi qurdalasın, kimdə nə cürət var idi.* M.Ə.Sabir. *Sübhanverdizadə adətinin ziddinə olaraq bu*

*gecə qızışıb çox içmişdi.* S.Rəhimov. [Qədir] *özünü kütlədən, yəni "qara camaatdan" ayırmaq üçün həmişə hamı deyənin ziddinə getdi.* Mir Cəlal.

**ZİDDİYYƏT** *is.* [*ər.*] 1. İki şey (fikir, hərəkət və s.) arasında olan tam uyğunsuzluq, əkslik, çox kəskin fərq, uyuşmazlıq. *Fikirlər arasında ziddiyyət. Əqli əməklə fiziki əmək arasındakı ziddiyyətin aradan qaldırılması. – Cəlil Məmmədquluzadə varlığa realist münasibət bəsləyən, həyatı dərindən görən, onu ziddiyyətləri, çarpışmaları və rəzalətləri ilə dərk edən bir sənətkar idi.* M.İbrahimov. // Uyğunsuzluq. *Onun sözlərindəki məntiqsizlik, fikirlərindəki ziddiyyət .. haqqında olan fikrimi tamamilə dəyişdirmişdi.* A.Şaiq. [Dilənçinin] *təbii gözəlliyi ilə geydiyi paltar arasındakı ziddiyyət o qədər böyük idi ki, insan ona baxarkən palçığa düşmüş bir dürr və ya gövhər gördüyünü zənn edirdi.* Ə.Sadıq.

2. Öz keyfiyyətləri, xassələri etibarilə başqası ilə uyğun olmayan, düz gəlməyən. *İri cüssəli və gur səsi etibarilə arvadı ilə tam bir ziddiyyət təşkil edən İsa ona məsləhət verirdi.* Ə.Əbülhəsən.

3. Ədavət, düşmənçilik. *Aralarında ziddiyyət var.*

4. *fəls*. Təbiət və cəmiyyətin əşya və hadisələrinə daxilən xas olan əksliklər münasibəti; təzad. *Sinfi ziddiyyətlər. Əmək ilə kapital arasında ziddiyyətlər.*

**ZİDDİYYƏTLİ** *sif.* Ziddiyyət olan, ziddiyyətlə dolu; təzadlı. *Yazıçı ziddiyyətli yaradıcılıq yolu keçmişdir. – Səməd Vurğun yaradıcılığının ilk dövrü çox ziddiyyətlidir.* O.Sarıvəlli.

**ZİDDİYYƏTLİLİK** *is.* Ziddiyyət olan hal, vəziyyət.

**ZİDDİYYƏTSİZ** *sif.* Heç bir ziddiyyət, əkslik, uyğunsuzluq olmayan. *Ziddiyyətsiz cəmiyyət.*

**ZİDDİYYƏTSİZLİK** *is.* Ziddiyyət olmadığı hal, vəziyyət.

**ZİDLİK** *is.* 1. Zidd olma, əleyhinə olma, əkslik, təzad. *Tərəqqiyə zidlik. Tarixi faktlara zidlik.*

2. Ədavət, düşmənçilik. *Aralarında zidlik var. Araya zidlik düşüb. – Bu taza arvad nanəcib olduğundan oğlanı yola verməyib hər neynən mümkündisə, atasıynan bunun arasına bir zidlik salmağa çalışır.* (Nağıl).

**ZİFAF** *is.* [*ər.*] Oğlanın (bəyin) qızla ilk görüşü. *İki gün əvvəl Münəvvərin zifafına dəvət olunmuş xanımlar yavaş-yavaş gəlib yuxarı başa keçirdilər.* M.S.Ordubadi. □ **Zifaf gecəsi (axşamı)** – oğlanın (bəyin) qız otağına girdiyi birinci gecə. *..Hərçənd zifaf gecəsi qız bir az atıldı-düşdü, amma bu atılıb-düşməyə bir çürük qəpik verməzlər.* "Mol. Nəsr." *Zifaf axşamının səhəri sağdış və soldış gəlib "bəyi" evdən çıxarıb sağdışgilə aparardılar.* R.Əfəndiyev. **Zifaf otağı** – oğlanla (bəylə) qızın birinci dəfə görüşdüyü otaq. [Rəşid:] *Zifaf otağında təzə gəlini görcək Qurbanqulu təəccüb edib dalı çəkilir.* T.Ş.Simurq.

**ZİFT** *is.* [*ər.*] 1. Şam ağacından, mədən kömüründən çıxan və odda əriyən qara, qatı maddə; qatran.

2. *məc*. Çox qara şey haqqında. *Zift kimi qara qurum.*

**ZİFTLƏMƏ** "Ziftləmək"dən *f.is.*

**ZİFTLƏMƏK** *f.* Zift sürtmək, zift vurmaq, ziftlə qapamaq.

**ZİFTLƏNMƏ** "Ziftlənmək"dən *f.is.*

**ZİFTLƏNMƏK** *məch*. Zift sürtülmək, zift vurulmaq, ziftlə qapadılmaq.

**ZİFTLİ** *sif.* 1. Zift sürtülmüş, zift vurulmuş; ziftə bulaşmış; qatranlı.

2. Tərkibində zift olan.

**ZİHƏYAT** *is.* [*ər.*] Canlı. *Yaxınlıqda heç bir zihəyat görünməyir, quyulardan neft dartan dərin tulumbaların yeknəsəq səsləri eşidilirdi.* S.Hüseyn. *Nə bir işıq görünür, nə də bir zihəyat səsi eşidilirdi.* C.Cabbarlı. *Bu səs qəsəbədə zihəyat olduğunu andırırdı.* H.Nəzərli.

**ZİKR** [*ər.*] *köhn*. 1. Anma, yad etmə, xatirə gətirmə, xatırlama, adını çəkmə, adını söyləmə. □ **Zikr etmək (eyləmək)** *köhn*. – 1) anmaq, yad etmək, xatirə gətirmək, adını çəkmək, adını söyləmək. [Dərviş:] *Mən də* [Ruqiyyənin] *adını ürəyimdə yox, dilimdə zikr etdim*. A.Divanbəyoğlu; 2) söyləmək, demək, ifadə etmək. *Bütün gün fikr eylərəm; Dərdimi zikr eylərəm.* (Bayatı). *..Necə ki vəzir zikr elədi, ona binaən mən bu cəhətdən qayətdə diləfsürdə idim*. M.F.Axundzadə. *Yuxarıda zikr etdiyimiz keyfiyyəti Mirzə özü nağıl*

*edirdi*. Ə.Haqverdiyev; 3) oxumaq (dua). *Alverçi hacılar, baqqallar, müamiləçilər, dəllallar bəzən sabaha qədər yatmazdı, namaz qılıb zikr edərdi*. H.Sarabski. **Zikr olunmaq** *köhn*. – 1) anılmaq, yad edilmək, xatirə gətirilmək, adı çəkilmək, adı söylənmək; 2) haqqında danışılmaq, söylənilmək, ifadə olunmaq. *Şah Abbasın cülusundan altı il keçib yeddinci il başlanmışdı ki, aşağıda zikr olunan qəziyyə vaqe oldu.* M.F.Axundzadə. *Ata ilə oğul arasında yuxarıda zikr olunan söhbətdən 1-2 ay keçəndən sonra Mirzə Cavad köçdü kəndə*. Ə.Haqverdiyev.

2. *din*. Təsbeh çevirə-çevirə dua etmə, Allahın adlarını və sifətlərini bir-birinin ardınca söyləyib təkrar etmə, vird etmə. ☐ **Zikr demək** – məsciddə axundun oxuduğu duanı onun ardınca eyni ilə təkrar etmək. **Zikr təsbehi** – dindarların dua oxuya-oxuya çevirdikləri təsbeh. [Hatəmxan] *özü isə mollanın ala-bəzək zikr təsbehini əlinə aldı*. S.Rəhimov.

3. Bütün fikir, bütün düşüncə, bütün xəyal (bu mənada adətən “fikir-zikir” şəklində işlənir). *Fikrim-zikrim, sözüm, xəyalım sənsən; Haçan könlüm səndən cidayə düşər.* M.V.Vidadi. *..Hətta namaz vaxtı da mömin müsəlmanın fikri və zikri dolu olur dolma ilə, ..isgəncəbi ilə.* C.Məmmədquluzadə.

**ZİQİYMƏT** *sif.* [*ər.*] *köhn*. Qiymətli, çox qiymətli, bahalı. *Atamdan mənə çox ziqiymət kitablar keçibdir*. Ə.Haqverdiyev. [Ərən:] *Xanım yürüdükcə cıqqasının ziqiymət qaşları minbir rəng çalırdı.* Çəmənzəminli. *Qoca Şərqin ilahi şeir sənətinin bu ziqiymət xəzinələri Mirzə Valehin üzünə açıq idi.* S.Rəhimov.

**ZİL**[1] *is.* [*fars.*] 1. Musiqi alətlərinin ən yüksək tonu (*bəm* əksi). // *sif.* Beyindən gələn ən yüksək və nazik (səs haqqında). *Zil səs*. – *Melodiya bir-biri ilə qarşılıqlı münasibətdə olan ayrı-ayrı səslərdən düzəlir. Bu səslər bir-birinə nisbətən zil* (*yüksək*) *və bəm* (*aşağı*) *olur.* Ə.Bədəlbəyli. *Birinci katibin kabinetindən eşidilən zil qışqırtı Səmədi diksindirdi*. İ.Hüseynov. ☐ **Zil pərdə** – yüksək (zil) səs çıxaran pərdə (tarda, sazda). [Araz] *sazın zil pərdəsini dilləndirir*. A.Şaiq. **Zilə çəkmək** – simli musiqi alətini yüksək tonda kökləmək; zil pərdədə çalmaq. *Tarı zilə çəkmək. – Sazı zilə çəkir, sözü dərinə; Mümkünmü düşünüb fikrə getməmək.* H.Hüseynzadə; // b a x **zilə qalxmaq**. *Xanəndə zilə çəkdiyindən hamının gözü onda idi*. M.Hüseyn. **Zilə gətirmək** – b a x **zilə çəkmək**. *Sazı zilə gətirmək*. **Zilə qalxmaq** – oxuyarkən və ya çalarkən ən yüksək not götürmək, ən yüksək tona keçmək; // zil pərdədə çalmaq. *Uzaqlarda, bir eyvanda zilə qalxır kaman, tar; Kənd üstüylə ötə-ötə durna uçur bir qatar*. Ə.Cəmil.

2. *köhn*. Zəng. [Əşrəf] *onları qürur ilə dinlədikdən sonra, masa üzərindəki zili basdı*. A.Şaiq.

◊ **Zilə çəkmək** *məc*. – 1) çox şişirtmək, ifrata varmaq; 2) sınamaq üçün bərkə-boşa çəkmək, sıxışdırmaq.

**ZİL**[2] *əd*. Tünd, lap, çox, tamamilə (adətən “qara” və “qaranlıq” sözlərinin əvvəlində işlənib, onların mənalarını şiddətləndirir). *Zil qara saçlar. Kömür kimi zil qara. – Zil qaranlıq gecə hər tərəfi bürümüşdü*. S.Rəhimov. *Üzünə dağılmış zil qara dalğalı saçları arasından Səmədin iri gözləri parıldayırdı.* İ.Hüseynov.

**ZİL**[3] *is.* Quş ifrazatı, quş peyini. *Tarlaları quş zili ilə gübrələmək*.

**ZİLDƏN** *zərf* Ucadan, zil səslə. *Zildən oxumaq*.

**ZİLHİCCƏ** *is.* [*ər.*] Hicri qəməri ərəb təqviminin on ikinci ayı. *Zilhiccə ayının 18-də* [qızın] *doqquz yaşı tamam olub, on yaşına ayaq qoyub.* C.Məmmədquluzadə.

**ZİLXAN** *is.* [*fars.*] *mus*. Zildə oxuyan xanəndə, zil səsi olan adam.

**ZİLİ** *is. xüs*. Xalça növlərindən birinin adı. [Xalçanın sumaq] *tipinin müxtəlif növləri Qubada, Qusarda, Qarabağda və Bakıda toxunur. Bəzi yerlərdə bu,* “*zili*” *və* “*vərni*” *də adlanır*. M.Tərlanov.

**ZİLQƏDƏ** *is.* [*ər.*] Ərəb qəməri təqviminin on birinci ayı. [Əli dayı:] *Zilqədə ayının 14-də Müzəffərəddin şah ölüb.* P.Makulu.

**ZİLLƏMƏ**[1] “Zilləmək[1]”dən *f.is.*

**ZİLLƏMƏ**[2] “Zilləmək[2]”dən *f.is.*

**ZİLLƏMƏK**[1] *f.* Gözlərini bir nöqtəyə dikmək, kirpiklərini qırpmadan diqqətlə bir nöqtəyə baxmaq (çox vaxt “gözlərini” sözü ilə). *Baxışını zilləmək. Nəzərini zilləmək. – Tərlan gözlərini zillədi; Dağ başından evin səmtin bəllədi*. A.Səhhət. *Əmrah birdən duruxdu.*

*Qəmgin gözlərini evinə tərəf zillədi..* M.Hüseyn. [Mürsəl] *müntəzir gözlərini mənə zilləmişdi.* Mir Cəlal.

**ZİLLƏMƏK²** *f.* Zilə keçmək, səsi zilə qaldırmaq. *Tərəqqi, tənəzzül kəmənçəsini; Gah zilləyib, gah da bəmə çəkirsən.* Aşıq Ələsgər.

**ZİLLƏNMƏK¹** 1. *qayıd*. Zilləyib baxmaq, gözlərini qırpmadan diqqətlə bir nöqtəyə baxmaq.

2. *məch.* Yönəldilmək, dikilmək. *Dörd nəfər yoldaşın nəzəri bir-birinə zillənir və hamıda eyni kədər və ələm hiss olunurdu.* H.Nəzərli. *..Xəlfə ayağa durub qapıya yanaşdı, hamının gözü ona zilləndi*. M.Hüseyn.

3. Dik qalxmaq. *Havaya zillənib, uçmaq istərdi; Dəhşətli bir meydan açmaq istərdi*. H.K.Sanılı.

**ZİLLƏNMƏK²** *f.* Zilə qalxmaq, yüksəlmək, ucadan səslənmək.

**ZİLLƏŞDİRİLMƏ** "Zilləşdirilmək"dən *f.is.*

**ZİLLƏŞDİRİLMƏK** *məch*. Zilə qaldırılmaq, tonu yüksəldilmək.

**ZİLLƏŞDİRMƏ** "Zilləşdirmək"dən *f.is.*

**ZİLLƏŞDİRMƏK** *f.* Zilə qaldırmaq, yüksək tona qaldırmaq (səsi).

**ZİLLƏŞMƏ** "Zilləşmək"dən *f.is.*

**ZİLLƏŞMƏK** *f.* Zilə qalxmaq, yüksək tona qalxmaq, tonu yüksəlmək.

**ZİLLƏT** *is.* [*ər.*] Çətinlik, ağır şərait, pis vəziyyət, ağır maddi ehtiyac, yoxsulluq, məşəqqət, üsrət. [Mehribanın atası:] [Mehribanın] *zillətdə qalmasına heç bir halda razı olmaram*. S.Hüseyn. [İkinci oğlu:] *Nə zillətdir, nə möhnətdir; Buna bais, bəli, sənsən!* Ü.Hacıbəyov. *Bilməyəcəksiniz nə dərd, nə zillət; Aşıb-daşacaqdır sizinçin dövlət*. S.Vurğun. // Həqirlik, xarlıq, alçalma. [Məsmə:] *Düşdüyüm mühit məni zillət və səfalət içində sürünməyə məhkum etmişdi*. S.Hüseyn. ☐ **Zillət çəkmək** – əziyyət içində yaşamaq, ağır vəziyyətdə olmaq, ehtiyac içində yaşamaq. *Fərhadü Məcnundən sən eylə ibrət; Müddət bari-qəmdə çəkdilər zillət*. Aşıq İskəndər bəy. [Bəbir bəy:] *Zillət çəkməsən, sabah qucağına alıb öpəndə heç ləzzət də verməz.* Mir Cəlal. **Zillətə salmaq** – 1) ağır vəziyyətə salmaq, ehtiyac içində yaşatmaq. *Hicran dərdi məni salıb zillətə; Səni görsəm dərdim azalı, Güllü.* Aşıq Ələsgər; 2) həqir etmək, xar etmək, alçaltmaq.

**ZİLLƏTLİ** *sif.* Zillətlə dolu, ağır, çətin, əzablı, məşəqqətli.

**ZİLLƏTMƏK** b a x **zilləmək**¹.

**ZİLLİ** *sif.* Zil tökülmüş, zil qarışmış, zil ilə örtülü (b a x **zil**³).

**ZİLTƏNG** *is.* Atın dal tərəfindən belinə çəkilən ip, toqqa, örkən. *Koroğlu Qıratın ziltəngini bərkitdi*. "Koroğlu".

**ZİLVİYƏ** *is.* Un, bal və yumurtadan hazırlanan şirniyyat növü.

**ZİMİSTAN** *is.* [*fars.*] *şair*. Qış, qış fəsli. *Zimistan çəkməyən bülbül baharın qədrini bilməz*. (Ata. sözü). *Addadı zimistan, gəldi növbahar; Şamamanın tağı yaşıldı, yaşıl.* Aşıq Ələsgər. *..Hər gecənin bir gündüzü və hər zimistanın bir baharı olar..* C.Məmmədquluzadə. *Pərişan gəzirsən bütün aləmi; Gözündə ilk bahar zimistan olur*. S.Vurğun.

**ZİNA** *is.* [*ər.*] *köhn*. Qeyri-qanuni cinsi əlaqə. ☐ **Zina etmək (eləmək)** – qeyri-qanuni cinsi əlaqədə olmaq. *...Bu rəvayət bir kişi ilə bir arvadın zina eləməyi barəsindədir.* C.Məmmədquluzadə.

**ZİNAKAR** *is.* və *sif.* [*ər.* zina və *fars*. ...kar] *köhn*. Zina edən, qeyri-qanuni cinsi əlaqədə olan (qadın və ya kişi). *Dedilər ki, sizin aranızda binamazlar, oruc tutmayanlar, yetim malına qəsd edənlər, zinakarlar, əqidəsi süst olanlar vardır*. Ə.Haqverdiyev.

**ZİNAKARLIQ** *is. köhn*. Qeyri-qanuni cinsi əlaqədə olma.

**ZİNCİLFƏRƏC** *is.* Əncir doşabı ilə unun qarışığından bişirilib qurudulduqdan sonra yeyilən (adətən qışda) şirni.

**ZİNDAN¹** *is.* [*fars.*] 1. Keçmiş zamanlarda: qaranlıq və müdhiş dustaqxana (adətən yerin altında olardı). *Zindana atmaq. Zindana salmaq. – ..Sultanın hökmü ilə zindanlarda çürüyən min-min məşrutəxahların ahü naləsi Kəlküttəyə çata bilməyib, çünki Kəlküttə çox uzaqdır.* C.Məmmədquluzadə. *Bu binanın* [ədliyyə sarayının] *..zirzəmisində məhbuslar üçün zindanlar vardır.* M.İbrahimov. *Zindana saldılar Leylanı o gün*. B.Vahabzadə. // Ümumiyyətlə, həbsxana, həbs, dustaqxana. *Qəbir kimi qaranlıqdır zindanım; Qurd-quş, siçan oynağıdır dörd yanım*. A.Səhhət. [Sona:] *O vaxt zindan naçalniki dustağı bizə təslim edər*. H.Nəzərli. [Ramazan:] *Söylə görüm bu cür yaşamaq ilə zindanda yaşamağın fərqi*

*nədir?* B.Talıblı. // Məc. mənada. [Zəhra:] *Ayrı düşdükcə Şeyx Sənandan; Mana guya cahan olur zindan.* H.Cavid.

2. *məc*. Çox qaranlıq, çox darısqal, cansıxıcı yer haqqında. *Bura lap zindandır ki... Zindan kimi bir otaq*.

◊ **Dünyanı zindana döndərmək** – əzab vermək, gününü qara eləmək. *Dünyanı bizdən ötəri; Döndərdi zindana, pişik!* Aşıq Ələsgər.

**ZİNDAN²** *is.* [*ər.*] Üzərində metal döymək üçün dəmirçi aləti. *Dəmirçi qabarlı əlinə hovxurub, çəkici bir-iki dəfə boş zindana vurdu.* B.Bayramov. ☐ **Zindan kimi** – çox ağır. *Yol uzun, həsrət ağır zindan kimi; Hansı xəncər yarasıdır ağrıda hicran kimi?!* R.Rza.

**ZİNDANBAN** *is.* [*fars.*] b a x **zindançı**. *Mollabaşı Axund Səməd Ərkin zindanında zindanbandan eşitdi ki, onun mənsəbini Molla Ramazana veriblər, qüssəsindən fücətən həlak oldu*. M.F.Axundzadə. [Səriyyə:] *Alçaq cinayətkarlar kimi məni həbsə alıb, nökəri də üstümə zindanban qoyublar.* C.Cabbarlı. *Qorxudan titrəyirdi zindanban; Yox idi nitqə onda tab-təvan.* Ə.Qəmküsar.

**ZİNDANBANLIQ** b a x **zindançılıq**.

**ZİNDANÇI** *is.* Zindan baxıcısı, həbsxana gözətçisi, həbsxanaçı.

**ZİNDANÇILIQ** *is.* Zindançının işi, vəzifəsi, zindan (dustaqxana) baxıcılığı.

**ZİNDANXANA¹** [*fars.*] b a x **zindan**¹. *Bəli, şahın əmri üzrə Qəməri bargahın xüsusi zindanxanasına saldılar.* (Nağıl). *Zindanxanada dar ağacı quruldu*. Çəmənzəminli.

**ZİNDANXANA²** [*ər.* sindan və *fars.* ...xanə] *klas.* b a x **dəmirçixana**.

**ZİNDANLAMA** "Zindanlamaq"dan *f.is.*

**ZİNDANLAMAQ** *f. köhn*. Zindana salmaq, həbsə salmaq. *Can alan, qan axıdanlarını zindanlamışıq*. Ə.Nəzmi.

**ZİNDANLANMA** "Zindanlanmaq"dan *f.is.*

**ZİNDANLANMAQ** *məch*. Zindana salınmaq, həbsə salınmaq.

**ZİNDƏ** *sif.* [*fars.*] *klas*. Diri, canlı. *Sən sanma ki oldur ol, mənəm mən; Bir can içrə zindədir iki tən*. Füzuli. *Hər zaman zindəyəm, hər zaman gəncəm; Şahları mat edən canlı şətrəncəm*. A.Şaiq.

**ZİNDƏGAN** *is.* [*fars.*] Həyat, yaşayış, məişət, dolanacaq, zindəganlıq, dirilik. *Sən də deyirsən, dünya görürəm, ərik, kişmiş şirəsinə bulana-bulana gün keçirərsən, deyirsən ki, elə dünyanın zindəganı budur*. Ə.Haqverdiyev.

**ZİNDƏGANİ** *is.* [*fars.*] Həyat, dirilik, dolanacaq. *Leyli sənə verdi zindəgani; Sən ol baqi, ol oldu fani*. Füzuli.

**ZİNDƏGANLIQ** *is.* Həyat, dirilik, yaşayış, dolanacaq, məişət. [Xotkar:] *Nə qədər ki bu Koroğlunun səsi kəsilməyib*, *dünya üzündə zindəganlıq bizə haram olacaq*. "Koroğlu". *Ölüm yeydir belə zindəganlıqdan*. Q.Zakir. *..Komediya zindəganlığın ayinəsidir.* N.Nərimanov. ☐ **Zindəganlıq etmək** – yaşamaq, dolanmaq, keçinmək, gün keçirmək, həyat sürmək. *Dərya dibində zindəganlıq edən heyvanat və nəbatatın çoxu bir yerə bənd olub qeyri yerə getmirlər*. H.Zərdabi. *İki ildən bir qədər ziyadə* "*Əkinçi*" *artıq üsrət və məşəqqət ilə zindəganlıq edib canını millət uğrunda fəda etdi*. F.Köçərli.

**ZİNƏT** *is.* [*ər.*] Bəzək, süs, yaraşıq. *Rəhimin evində səhər tezdən qonaqlıq tədarükü görülürdü. Bahar, Rəhimə və Rahim süfrənin zinəti ilə məşğul idilər.* S.S.Axundov. *Hünərdir əmrə ilk zinət, onun hüsnündə məna var*. S.Vurğun. *Çoxdur hədiyyələr insan adına; Qiymətli zinətlər, qiymətli daşlar*. B.Vahabzadə. ☐ **Zinət vermək (vurmaq)** – zinətləndirmək, bəzəmək, süsləmək. *Qarı nənə .. göyün üzünə yeddi qələmlə yeddi zinət vururdu*. "Koroğlu". *Nə zinət veribdir eyvan, otağa; Ətri qoxur Bağdad baharı kimi.* Aşıq Ələsgər. *Xoş avazın verir zinət; Bu leylü nəhara, bülbül!* Molla Cümə. **Özünə zinət vermək** – 1) bəzəmək, qiymətli daş-qaş taxmaq və qəşəng geyinmək. *Məlik Cümşüd .. özünə zinət verib getdi Nuşapəri xanımın yanına*. (Nağıl); 2) üzünə ənlik-kirşan vurmaq, üz-gözünü boyamaq.

**ZİNƏTÇİ** *is.* Zinət verən, zinət vuran adam; bəzəkçi.

**ZİNƏTÇİLİK** *is.* Zinətçinin işi, peşəsi, sənəti.

**ZİNƏTLƏMƏ** "Zinətləmək"dən *f.is.*

**ZİNƏTLƏMƏK** *f.* Bəzəmək, zinət vermək, süsləmək, gözəlləşdirmək.

**ZİNƏTLƏNDİRİLMƏ** "Zinətləndirilmək"dən *f.is.*

**ZİNƏTLƏNDİRİLMƏK** *məch*. Zinət verilmək, bəzədilmək, süsləndirilmək.

**ZİNƏTLƏNDİRMƏ** "Zinətləndirmək"dən *f.is.*

**ZİNƏTLƏNDİRMƏK** *f.* Bəzəmək, süsləmək, bəzək vurmaq, yaraşıq vermək. *Məgər bu səhranı zinətləndirən və ağacın özünə hüsn və lətafət verən biz yarpaqlar deyilik?* F.Köçərli.

**ZİNƏTLƏNMƏ** "Zinətlənmək"dən *f.is.*

**ZİNƏTLƏNMƏK** *qayıd.* Bəzənmək, süslənmək, özünə bəzək-düzək vermək; qəşəng geyinmək. *..Seyrəngah yaşıl otla, .. rəngli çiçəklərlə zinətlənmişdi.* S.S.Axundov.

**ZİNƏTLİ** *sif.* Bəzəkli, süslü, bəzənmiş; qəşəng geyinmiş, bəzəkli-düzəkli. *Zinətli nərgizdən, tər bənövşədən; Al-yaşıl geyinib şad olan dağlar!* Aşıq Dilqəm. *Azacıq sonra, Həmzə .. zinətli, amma tör-töküntülü otağın yuxarı başında dayandı.* Ə.Əbülhəsən.

**ZİNG** *is.* 1. *anat. məh.* İnsan və heyvanlarda bazı və baldır sümüyü.

2. B a x **zingirə**.

**ZİNGİLDƏMƏ** "Zingildəmək"dən *f.is.*

**ZİNGİLDƏMƏK** *f.* 1. Zingilti səsi çıxarmaq. *Buruq-buruq bacalardan çıxır tüstü, ağ duman; Küçələrdə it soyuqdan zingildəyir, üşüyür.* A.Səhhət. *İtlərin bir neçəsi cürətlənib mağaranın içinə soxuldu. Ancaq çox çəkmədi, yenə zingildəyə-zingildəyə* (z.) *geri qayıtdılar.* S.S.Axundov. *Haf-haf gəldi, zingildədi; Quyruğunu qısıb dedi: – Sənin xallı küçüyünəm; Burnu qıllı küçüyünəm.* M.Dilbazi.

2. Zınqıldatmaq.

**ZİNGİLDƏŞMƏ** "Zingildəşmək"dən *f.is.*

**ZİNGİLDƏŞMƏK** *qarş.* Hamı birdən zingildəmək. *Vahiməyə düşmüş itlər zingildəşir, uzaq briqadaların iclasa gələn heyət üzvlərinin atları kişnəşirdi.* B.Bayramov.

**ZİNGİLDƏTMƏ** "Zingildətmək"dən *f.is.*

**ZİNGİLDƏTMƏK** *icb.* 1. Zingildəməyə məcbur etmək, zingildəməsinə səbəb olmaq. *İti vurub zingildətdi.*

2. Zınqıldatmaq.

**ZİNGİLTİ** *is.* Vurulan və ya xəstə itin çıxardığı səs, zarıltı.

**ZİNGİRƏ** *is.* Kiçik üzüm salxımı. *Üzümü elə təmizləyiblər ki, deyərsən, günorta çağı buradan bir dəstə oğru keçib. Bir zingirə də qalmayıb.* Mir Cəlal.

**ZİNGVARA** *is.* Salxımları çox xırda və dənələri tökülmüş üzüm.

**ZİNHAR** *nida* [*fars.*] *klas.* Məbada, amandır, ay aman, saqın, ehtiyatlı ol (adətən bir şeydən saqındırmaq üçün işlənir). *Ey iki gözüm, yaman olur ar; Namusumuzu itirmə, zinhar!* Füzuli. *Yatsa o mahparə, yatar bəxtimiz bizim; Zinhar, qoymayın onu, zinhar, yatmasın.* S.Ə.Şirvani. *Zinhar, vəfa etmə tələb ər dediyindən; Sərvəqt ol, amandır!* M.Ə.Sabir. *Məni bənzətməyin Məcnuna, zinhar; Ahımca olsaydı Məcnunun ahı; Yuva tikərdimi başında quşlar?* B.Vahabzadə. ☐ **Zinhar etmək (eləmək)** – b a x **zinhara gətirmək**. **Zinhar olmaq** – b a x **zinhara gəlmək**. **Zinhara gəlmək** – usanmaq, bezikmək, yorulmaq, cana gəlmək, təngə gəlmək. *Lay-lay dedim yatınca; Gözlərəm Ay batınca; Canım zinhara gəldi; Sən hasilə çatınca.* (Bayatı). *Day camaat* [Qara xanın] *əlindən zinhara gəlmişdi.* "Koroğlu". *Vallah, bu gədənin əlindən lap zinhara gəlmişəm.* M.Süleymanov. **Zinhara gətirmək** – bezikdirmək, usandırmaq, yormaq, cana gətirmək, təngə gətirmək. [Səməd bacısına:] *Ay arvad, bu xalqı nə zinhara gətirdin? Sənə demədimmi çox zarıldayıb, zırıldama.* B.Talıblı. *Bu uzun gecə Mədədovu lap zinhara gətirmişdi.* Ə.Əbülhəsən.

**ZİR** *is.* [*fars.*] Ərəb (fars) əlifbasında "e" səsini bildirmək üçün samitlərin altına qoyulan ◌ِ işarəsi; kəsrə.

**ZİRA** *bağl.* [*ər.*] Çünki, ona görə ki (bəzən "ki" bağlayıcısı ilə). *Deməzəm dəxi: "Sənə aşiqəm", ey gül! Zira; Sənə aşiqliyim izhar edəli xar olubam.* Füzuli. *Zira ki, atası şahımızdır; Hər müşkül işə pənahımızdır.* Məsihi. *Yusif uşaqlarının içində hamıdan çox kiçik qız Sonanı istəyirdi. Zira ki, Sona əxlaq və ətvarda hamıdan gözəl bir qız idi.* N.Nərimanov. *..Öz ana dilimizdə tədris və təlim etmək indi bizim əməllərimizin ən ümdəsidir.. Zira nəşri-maarif və təlimi-mədəniyyət üçün yeganə vasitəmiz bir bu təriqdir.* Ü.Hacıbəyov.

**ZİRAB** *is.* [*fars.*] *köhn.* Ayaqyolu.

**ZİRAƏT** *is.* [*ər.*] *köhn.* 1. Əkinçilik. *Sizin yerin camaatı ziraətə məşğul olarmı?* Ə.Haqverdiyev. *Maarif, nəqliyyat, ziraət, ticarət və sair işlərimizin islaha böyük ehtiyacı vardır.* M.S.Ordubadi.

2. Əkin, əkinəcək, bitki. *Mayın 7-də 5 saat yağış yağıb ziraətlərə ziyadə nəf yetirdi, xəla-*

*yiqi şad elədi*. "Əkinçi". *Əlbət, əlbət elədir, hələ qorabişirən qabaqdadır! – Elə odlu gün yağmasa, yerdən ziraət qalxmaz*. S.Rəhimov.

**ZİRCAMƏ** *is*. [*fars*.] *köhn*. Alt paltarı, tuman-köynək. *Çamadanın içində .. bir neçə top ağ köynək və zircamə və bir neçə dənə ağ dəsmal vardı*. S.M.Qənizadə. *Ağa Ələsgərağa zircamədə qılmanları başına toplayıb hoppan-hoppan oynayırdılar*. Çəmənzəminli.

**ZİRCAMƏLİK** *is. köhn*. Zircamə üçün yararlı, alt paltarlıq. *Zircaməlik parça*. – [Xonçaya] .. *bir dəst ipək parçadan zircaməlik, iki ədəd imperial və sair ufaq-tufaq şeylər qoyulardı*. R.Əfəndiyev.

**ZİRDƏST** *is*. [*fars*.] *köhn*. Əlaltı, köməkçi. [Şah:] *Xacə Mübarək, sənin zirdəstlərin də çölə çıxsınlar, sən qal!* M.F.Axundzadə.

**ZİREH** *is*. [*fars*.] 1. *köhn*. Ox və s. yaralayıcı silahlardan qorunmaq üçün döyüşçülərin üstdən geydikləri dəmir tordan, yaxud qalın dəridən geyim. [Yaşlı kişi:] ..*İri vücudlu kor bir dilənçi iki əli ilə zirehi silkələyərək qışqırırdı*. S.Hüseyn. ☐ **Zireh kimi, zirehtək** – tor kimi, deşik-deşik. *Sinəmi göz-göz zirehtək etdi peykanın sənin*. Qövsi.

2. Hərbi gəmilərdə, tanklarda və s.-də xüsusi polad laylardan ibarət möhkəm qoruyucu örtü. *Polad zireh. – Birinci mərmi tankın zireh qisminə dəyərək, deyəsən, kənara sürüşüb partladı*. Ə.Əbülhəsən. *Keçir tanklarımız – zəhmli, qorxunc; Axır bir sel kimi dəmir, zireh, tunc*. Ə.Cəmil.

3. *zool*. Bəzi heyvanların (tısbağa, timsah və b.) bədənini örtən bərk qabıq. *Tora qara rəngli dəri zirehi olan nəhəng bağa düşmüşdü*.

**ZİREHDEŞƏN, ZİREHDƏLƏN** *sif. hərb*. Zirehli örtüləri deşən, dəlib keçən. *Zirehdeşən mərmi. Zirehdələn top*.

**ZİREHLƏMƏ** "Zirehləmək"dən *f.is*.

**ZİREHLƏMƏK** *f*. Zireh vurmaq, bir şeyin üzərini zirehlə örtmək.

**ZİREHLƏNMƏ** "Zirehlənmək"dən *f.is*.

**ZİREHLƏNMƏK** *məch*. 1. *köhn*. Zireh geymək (b a x **zireh** 1-ci mənada).

2. Zirehlə örtülmək, üzərinə zireh çəkilmək (b a x **zireh** 2-ci mənada).

**ZİREHLƏNMİŞ** *f.sif*. b a x **zirehli** 1-ci mənada. *Dəniz kimi coşub-daşır; Zirehlənmiş pəhləvanlar*. S.Vurğun.

**ZİREHLİ** *sif*. 1. *köhn*. Zireh geymiş (b a x **zireh** 1-ci mənada). *Zirehli döyüşçü*.

2. Zirehlə örtülmüş, üzərinə zireh çəkilmiş (b a x **zireh** 2-ci mənada). *Zirehli gəmi. Zirehli avtomobil. – Faşist təyyarəsi zirehli* (z.) *olduğundan, ona adi güllə batmırdı*. M.Rzaquluzadə.

3. Üstü zirehlə örtülmüş (b a x **zireh** 3-cü mənada). *Zirehli tısbağa. Zirehli balıqlar*.

**ZİRƏ** *is. bot*. Çətirçiçəklilər fəsiləsindən iki və ya çoxillik ot cinsi və həmin bitkinin ədviyyat kimi xəmirə və s.-yə qatılan xoşiyli toxumu. *Zirəni Kirmana aparır*. (Ata. sözü). *Zirə Azərbaycanda meşə qurşağından başlamış ta Alp qurşağına qədər yayılmış otdur*. M.Qasımov.

**ZİRƏÇİÇƏYİ** *is. bot*. Çoxillik bəzək bitkisi.

**ZİRƏFKƏND** *is*. [*fars*.] *mus*. Azərbaycan muğamlarından birinin adı. *12 əsas muğam bunlar idi: üşşaq, nəva, busəlik, rast, əraq, isfahan, zirəfkənd, büzürg, zəngulə, rəhavi, hüseyni və hicaz*. Ü.Hacıbəyov.

**ZİRƏK** *sif*. [*fars*.] Bacarıqlı, əlindən iş gələn, cəld, çevik, çox diribaş. [Hacı Qara:] *Yaxşı, siz istəyirsiniz ki, quşdan da zirək olub Arazın o tayına səkəsiniz?* M.F.Axundzadə. *Bir qədər diribaş və zirək uşaqlar mollanın xəlfəsi olardılar*. H.Sarabski. ☐ **Zirək tərpənmək (tərpəşmək)** – 1) tez, cəld hərəkət etmək. [Kərbəlayı Fatma xanım:] ..*Ay qız, Zeynəb, tez ol, yataqları gətir, bu tərəfdən qoy... Tez ol! Bir azacıq zirək tərpəş!* C.Məmmədquluzadə; 2) başqalarından tez hərəkət etmək, bir işdə başqalarını qabaqlamaq.

**ZİRƏKLƏNDİRMƏK** b a x **zirəkləşdirmək**.

**ZİRƏKLƏNMƏ** "Zirəklənmək"dən *f.is*.

**ZİRƏKLƏNMƏK** b a x **zirəkləşmək**.

**ZİRƏKLƏŞDİRMƏ** "Zirəkləşdirmək"dən *f.is*.

**ZİRƏKLƏŞDİRMƏK** *f*. Zirəkləşməsinə səbəb olmaq, daha da zirək etmək.

**ZİRƏKLƏŞMƏ** "Zirəkləşmək"dən *f.is*.

**ZİRƏKLƏŞMƏK** *f*. Daha da zirək olmaq, cəld olmaq, diribaş olmaq, çevik olmaq, bacarıqlı olmaq. *Uşaq böyüdükcə zirəkləşir. – Doğrudan da Rüstəmin oğlu zirəkləşmişdi*. S.Rəhimov.

**ZİRƏKLİK** *is.* Bacarıq, əlindən iş gəlmə, çəldlik, çeviklik, diribaşlıq. *Uşağın zirəkliyi*. – [Nəbi] *öz zirəklik və qoçaqlığı ilə Şuşa qalasında məşhurlaşır.* "Qaçaq Nəbi". *Altı il ərzində Budaq oxudu, tərbiyələndi. Gözəl əxlaqı, pak və səmimi ürəyi, həddən artıq zirəkliyi və qabiliyyəti onu müəllimlərə və həm də yoldaşlarına çox sevdirdi*. Ə.Vəliyev. □ **Zirəklik göstərmək** – çəld hərəkət etməklə, tədbir görməklə bir şeyi o birilərindən daha tez əldə etmək; qabaqlamaq. *Qoca Firuz bu gün .. zirəklik göstərib*. Ə.Məmmədxanlı.

**ZİRƏNG** bax **zirək**. *Tülkünün zirəngi iki ayağından tələyə düşər*. (Ata. sözü). *Aldanma özün bir kəsə, huşyarü zirəng ol.* M.Ə.Sabir.

**ZİRƏNGLİK** bax **zirəklik**.

**ZİRİNC** *is.* [*fars.*] *bot*. 1. Yarpaqlarının bir hissəsi tərsinə çevrilmiş, çiçəyi açıq-sarı rəngli, meyvəsi turşməzə olan kol bitkisi. [Ev sahibi] *burada cavan şiv zirinc ağacından qırıb gətirər, ocaqda ütüb çəkiclə döyər, özü üçün lopa düzəldərdi..* S.Rəhimov. [S.Vurğun] *ayaq saxlayıb bir zirinc kolunun dibində bitmiş gülxətmi çiçəklərindən dərdi..* Aşıq Şəmşir.

2. Həmin bitkinin ədviyyə kimi xörəyə qatılan turşməzə meyvəsi.

**ZİRİNCÇİÇƏKLİLƏR** *cəm bot.* Zirinc və başqa kol və ya çoxillik bitkilərin daxil olduğu bitki fəsiləsi.

**ZİRİŞ(K)** bax **zirinc**. *Dağda ziriş kolları; Çapar tutub yolları; Yar dərdin necə yazsın; Bağlanıbdır qolları*. (Bayatı). *Alçaqboylu iydə, zirişin ətri hər yana yayılır*. Mir Cəlal.

**ZİRÜ ZƏBƏR** *klas.* bax **zir-zəbər**. *Qəm kişvəri könlüm kimi zirü zəbər olmuş*. Qövsi. [Məstəli şah:] *Qaldırın Pariji yerindən, vurun yerə, bu saatda necə ki, mən bu heykəli vurub zirü zəbər edirəm.* M.F.Axundzadə. *Derdim ki, könül zirü zəbər olmasın, oldu*. S.Ə.Şirvani.

**ZİRVƏ** *is.* [*ər.*] Dağın ən yüksək nöqtəsi, təpəsi. *Dağın zirvələri qarla örtülüdür.* – *Qafqaz altımdadır, ən müdhiş olan zirvədə mən; Tutmuşam, tək uçurum qarlı dağ üstündə qərar*. A.Səhhət. *Uzaqda dağların zirvəsi neçə min illərlə əriyib tükənmək bilməyən qarı ilə əfsanəvi bir quşa bənzəyir.* R.Rza. *Səsləyir yurdumun şeri, zinəti; Zirvəsi dumanlı o dağlar məni.* M.Dilbazi. // *məc*. Bir şeyin ən yüksək pilləsi, dərəcəsi, nöqtəsi. *Burda yaxşı işləyən adamın çıxmayacağı bir zirvə yoxdur.* M.İbrahimov. *Deyirəm həmişə həyata da biz; Uca zirvələrdən baxa biləydik!* B.Vahabzadə.

**ZİR-ZƏBƏR** *zərf* [*fars.*] Alt-üst. □ **Zir-zəbər etmək** – alt-üst etmək, vurub dağıtmaq, yerlə yeksan etmək. **Zir-zəbər olmaq** – alt-üst olmaq, dağılmaq, pozulmaq, məhv olmaq.

**ZİRZƏMİ** *is.* [*fars.*] Yer altında olan ev, anbar və s. *Zirzəmidə oturub balaxana yuxusu görür.* (Ata. sözü). *İçərişəhərdə, Yuxarı bazarda, Qoşa karvansaranın altın-da tağ bir zirzəmi vardı.* H.Sarabski. *Qoçər gözlərini açanda özünü kif qoxuyan bir zirzəmidə gördü*. M.Rzaquluzadə.

**ZİR-ZİBİL** *top*. 1. Tör-töküntü, süpürüntü, tullantı. *Tikəndə quş yuva çör-çöp yığıban zir-zibil istər*. Q.Zakir. [Cəmilə:] *Budur, papiros kötüyü kimi zir-zibili atmağa məxsus qablar!* S.Hüseyn. [Çimnaz:] *Ay bala, orada oturma, zir-zibildi.* Ə.Əbülhəsən.

2. *məc*. Yaramaz, pis şeylər və ya adamlar haqqında. *Sözlər də cəvahir kimidir, əsli bədəldən; Təşxis verən olsa, bu qədər zir-zibil olmaz.* Şəhriyar.

**ZİŞAN** *sif.* [*ər.*] *klas*. Şanlı. *Kişidən istənilən işdir, iş; Kim ki, iş yapdı o, zişan oldu*. M.Ə.Sabir. *Baş qoşma, o cür alimi-zişana dolaşma.* Ə.Qəmküsar.

**ZİŞT** *sif.* [*fars.*] *klas*. Çirkin. *Vaqifəm, göz yum, cahanın baxma xubü ziştinə*. M.P.Vaqif.

**ZİVANA** *is.* 1. Dəyirman daşının ortasındakı qazıq, oyuq.

2. Bir şeyin iki parçasını bir-birinə rəbt edən içiboş mil; bir-birinin içinə keçən iki şeyə açılan oyuq.

3. Qəlyan çubuğu ağızlığının keçirildiyi içiboş mil.

**ZİVƏ** *is. məh*. Paltar asmaq üçün çəkilən ip. *Zivəyə paltar sərmək*.

**ZİVƏR** *is.* [*fars.*] *klas*. Zinət, bəzək, süs. *Qəribə-qəribə zinət və zivərləri şaha göstərirdilər*. M.F.Axundzadə. *Yaraşdırdı məşşatələr zivəri; Bəzəndirdilər ol mələkmənzəri*. M.Ə.Sabir. *Neçə məktəblərimiz var, neçə cəmiyyətimiz; Zərimiz, zivərimiz, qüvvətimiz, qüdrətimiz*. Ə.Nəzmi.

**ZİYA** *is.* [*ər.*] İşıq, aydınlıq, nur. *Mən onun dərdinə oldum mübtəla; Şəmi-xəyalıma o*

*verir ziya*. M.P.Vaqif. *Dağların, bağların libası sarı; Günəşin də sönük ziyası sarı*. A.Səhhət. *Qaramtıl bir bulud parçası qüruba əyilən günün qabağını tutduğu üçün çölün biz olan hissəsinə kölgə düşmüş, qalan yerlər isə qızılı ziya içindəydi*. İ.Əfəndiyev. ◻ **Ziya saçmaq** – nurlandırmaq, işıqlandırmaq. [Gülər:] *Gülsün günəş, ziyasını saçsın səmalərə!* C.Cabbarlı.

**ZİYAD**[1] *zərf* [*ər.*] *klas*. Çox, artıq. *Kirvə Məhəmmədxan bəy! Dövlətin ziyad; Həm evin abad, sümüyün polad.* Aşıq Piri. ◻ **Ziyad etmək (eyləmək)** – artırmaq. *Çərxi-fələk zülmü ziyad eləmiş; Hicran məni gündə döyər, ağlaram.* M.V.Vidadi. [Pəri və Şölə xanım:] *Ağa, Allah sənin ömür və dövlətini ziyad eləsin, yüz il xanlıq edəsən!* M.F.Axundzadə. **Ziyad olmaq** – çoxalmaq, artmaq. *Zövq üzrə mey artırırdı zövqüm; Şövq üzrə ziyad olurdu şövqüm*. Füzuli. *Ziyad olur gözümün nuru, ey gözüm nuru; Səbahü şam təmaşayi-xəttü xalında.* S.Ə.Şirvani. *Əgər ki yayda zəhməti əkinçinin ziyad olur; Ziyad olursa, qış günü o da o qədr şad olur*. A.Səhhət.

**ZİYAD**[2] *is.* Kütüm balığının xalq arasında işlənən adı.

**ZİYADAR** *sif.* [*ər.* ziya və *fars*. ...dar] *klas.* İşıqlı, nurlu. *Əsarət bərqi xurşidi-ziyadarınla məhv oldu*. M.Hadi. [Xarrat:] *Bizim Fransada, məsələn, ev heyvanlarının cins və növünün yaxşılaşması üçün bir çox cəmiyyətlər təsis olunmuş ..və ziyadar məskənlər vücuda gətirilmişdir*. T.Ş.Simurq. *Gündə bir fənn qoyur ərsəyə əfkari-bəşər; Min qəraib çıxarır əqli-ziyadari-bəşər.* Ə.Nəzmi.

**ZİYADƏ** *zərf* [*ər.*] 1. Çox, artıq, çoxlu. *Dağdan endim piyada; Dərdim vardır ziyada; Biz xəlvətdə görüşdük; Aləmə düşdü səda.* (Bayatı). [Müsyö Jordan:] *Bir il çəkər gedib gəlməyi, ziyadə çəkməz*. M.F.Axundzadə. *İmtahan ilə bilinib ki, meşə olan yerə ziyadə yağış yağır. Ol səbəbə bu yer artıq nəm olur*. "Əkinçi". // *Zərf mənasında.* Son dərəcə, olduqca. *Bu həqiqət Minanı ziyadə şad elədi.* İ.Musabəyov. // Qoşma mənasında. *Təsəvvür eyləmə kim, məst edibdi badə məni; Gözündü məst qılan badədən ziyadə məni.* S.Ə.Şirvani. *Hamı dərddən ziyadə; Bu dərd mana kar elədi...* Aşıq Ələsgər. // Sif. mənasında. *Ziyadə söz lazım deyil. – Ziyadə qəmzədəyəm hicr ilə xoş ol günlər; Ki mən bu qəmzəlikdən ziyadə xürrəm idim.* Füzuli. ◻ **Ziyadə etmək** – artırmaq, çoxalmaq, daha da artırmaq, bollaşdırmaq. *Fərhadə, Məcnunə məni tay etdin; Elədin dərdimi ziyadə, fələk!* Aşıq Zabit. **Ziyadə olmaq** – artmaq, çoxalmaq, daha da artmaq, bollaşmaq. *Ürəyim dəryadı, könlüm bir ada; Dərdim oldu günü-gündən ziyada*. "Əsli və Kərəm". [Koroğlu Qırata dedi:] *Günbəgündən dərdim oldu ziyadə; Alma gözlüm, qız birçəklim, Qırat, gəl!* "Koroğlu". **Ziyadəsi ilə** – artıqlaması ilə, artıq olaraq, olduqca çox. *Oğlanın anası, bacısı olduğunu bilib qızın anası bunlara ziyadəsi ilə hörmət elər...* R.Əfəndiyev.

2. **Ziyadədir** şəklində – artıqdır, çoxdur. *Kürreyi-ərzin ömrü 10-20 min il deyil, bəlkə 10-20 milyon ildən də ziyadədir.* H.Zərdabi. *Hacı Əsgərin təvanası nəinki yetmiş iki min, bəlkə iki yüz yetmiş iki mindən ziyadədir*. S.M.Qənizadə

**ZİYADƏLƏNDİRMƏ** "Ziyadələndirmək"dən *f.is.*

**ZİYADƏLƏNDİRMƏK** bax **ziyadələşdirmək**.

**ZİYADƏLƏNMƏ** "Ziyadələnmək"dən *f.is.*

**ZİYADƏLƏNMƏK** *f.* Ziyadə olmaq, çoxalmaq, artmaq, bollanmaq. *Atlı piyadalandı; Dərdi ziyadələndi..* (Bayatı). *Şahın vəhşəti qayətdə ziyadələnməyə başladı*. M.F.Axundzadə.

**ZİYADƏLƏŞDİRMƏ** "Ziyadələşdirmək"dən *f.is.*

**ZİYADƏLƏŞDİRMƏK** *f.* Artırmaq, çoxaltmaq, daha da artırmaq, bollaşdırmaq.

**ZİYADƏLƏŞMƏ** "Ziyadələşmək"dən *f.is.*

**ZİYADƏLƏŞMƏK** *f.* Artmaq, çoxalmaq, daha da artmaq, bollaşmaq. [Nadir bəy:] *İnsanlar arasında ülfət ziyadələşdikcə, şübhəsiz, könüldəki təəssürat və məhəbbət də o nisbətdə artmağa başlar*. H.Cavid. *İçərisində yaşadığımız iyirminci əsrdə elmlərin ədədləri bir dərəcədə ziyadələşmişdir ki, .. saymaqla qurtarmaq olmaz*. F.Ağazadə.

**ZİYADƏSİNCƏ** *zərf* Artıqlaması ilə, çoxlu. *Səkinə oğlunun qeyrət və hümmətini görüb ziyadəsincə şad idi.* "Məktəb".

**ZİYAFƏT** *is.* [*ər.*] Təntənəli qonaqlıq. *Qazax bəylərindən qonağı gəldi; Bir həftə ziyafət göyə yüksəldi*. Aşıq Ələsgər. *Xüsusən*

*bu vaxt ziyafətdə iştirak edən ziyalı xanımların gözləri dolmuşdu*. S.Rəhimov. *Bayırda qoparır toplar qiyamət; Torpağın altında gedir ziyafət.* M.Rahim.

**ZİYALANDIRILMA** "Ziyalandırılmaq"-dan *f.is.*

**ZİYALANDIRILMAQ** *məch*. 1. İşıqlandırılmaq, nurlandırılmaq.

2. *məc*. Maarifləndirilmək.

**ZİYALANDIRMA** "Ziyalandırmaq"dan *f.is.*

**ZİYALANDIRMAQ** *f.* 1. İşıqlandırmaq, nurlandırmaq. *Milləti ayıldan və onun ruhani və cismani qüvvələrini hərəkətə gətirən, qəlbini ziyalandırıb, ruhunu təzələndirən gözəl və ali fikirlər, hüsni-tədbirlər, doğru və salamat sözlər və səmimi-qəlbdən çıxan avazlar olacaq*. F.Köçərli.

2. *məc*. Maariflәndirmək.

**ZİYALANMA** "Ziyalanmaq"dan *f.is.*

**ZİYALANMAQ** *f.* 1. İşıqlanmaq, nurlanmaq. *Günəş çıxdı, ziyalandı yer üzü; Cilalandı səfalandı yer üzü*. A.Səhhət. *Ziyalanır bütün evlər, cahan olur rövşən*. H.Cavid.

2. *məc*. Maariflənmək. *Elm ilə ziyalanar bu millət; Qalxar bu təəssübü cəhalət...* A.Səhhət.

**ZİYALI** 1. *is.* Elm, texnika, mədəniyyət sahəsində təhsilə və xüsusi biliyə malik olan və əqli əməklə məşğul olan adam. *Hər kəndin özünə görə ziyalıları var...* Ə.Sadıq. *Heç zaman ziyalı sayıla bilməz; Özgənin dərdini yaşamayan kəs*. B.Vahabzadə. // Ümumiyyətlə, oxumuş, mədəni, savadlı adam. // Sif. mənasında. *Ziyalı təbəqələr. Ziyalı qadınlar*. – [Rəcəb:] *Naçalnik müavini dedi ki, axı siz ziyalı cavanlarsınız*. Qantəmir.

2. *sif.* Açıq, aydın, nurlu, işıqlı. *Mənim bağım, baharım! Fikri ziyalı, oğlum*. M.Ə.Sabir.

**ZİYALILAŞMA** "Ziyalılaşmaq"dan *f.is.*

**ZİYALILAŞMAQ** *f.* Ziyalı olmaq, mədəni olmaq, mədəniləşmək. *Kənd məktəbində dərs deyirdi, fikrən də Mirzə Kərim ziyalılaşmışdı.* C.Cabbarlı.

**ZİYALILIQ** *is.* Mədənilik, fikri-açıqlıq.

**ZİYAN** *is.* [*fars.*] Zərər. *Ziyan vermək. Ziyan vurmaq. Ziyan dəymək. Ziyana düşmək. Ziyan gətirmək. Ziyan görmək. Ziyan toxunmaq. Ziyan çəkmək. – Ziyanın yarısından qayıtmaq da qazancdır*. (Ata. sözü). *Neyçün özünə ziyan edirsən? Yaxşı adını yaman edirsən?* Füzuli. [Cavan kəndli:] [Pərviz xanın] *hər gəlməyindən rəiyyətə nə qədər ziyan toxunur.* Ə.Haqverdiyev. [Sultan:] *Mən bu dəfə əl çəkməyəcəyəm, özü də heç bir ziyan görməyəcəyəm*. İ.Hüseynov.

◊ **Ziyan eləmək** – uşaq salmaq.

**ZİYANÇI** *is.* və *sif.* Cinayət məqsədi ilə xalqa, dövlətə ziyan vuran, pislik edən (adam); ziyankar. // Zərərli, zərərverən. *Daha səni çəkməyəcəm; Ziyançısan, ay papiros*. Aşıq Əziz.

**ZİYANÇILIQ** *is.* Ziyançının gördüyü cinayət işi; cinayət məqsədi ilə xalqa, dövlətə ziyan vurma, pislik etmək məqsədi ilə görülən iş. [Zinyət:] *Bu, ziyançılıqdan başqa bir şey deyildir.* S.Rəhman.

**ZİYANXOR** [*fars.*] b a x **ziyankar**. *Siçan ziyanxor heyvandır.*

**ZİYANXORLUQ** b a x **ziyankarlıq**.

**ZİYANKAR** *sif.* [*fars.*] Ziyan verən, ziyan toxunduran, ziyançı, zərərverən; ziyan və zərərə səbəb olan, müzür. [Kərim baba:] *Baxın o, ilan quyruğu kimi qara buludu görürsünüzmü? Çox ziyankar buluddur*. A.Şaiq. // İs. mənasında. *Gözə görünməyən ziyankarlar* (*mikroblar*).

**ZİYANKARLIQ** b a x **ziyançılıq**.

**ZİYANLI** b a x **zərərli**. *Acıqlı qalxan, ziyanlı oturar*. (Ata. sözü). *Mən onun qəsdən ziyanlı bir addım atdığına inanmıram.* M.Hüseyn.

**ZİYANLIQ** *is.* Zərər, itki, tələfat, xəsarət, zərər. *Zəf eylədi aciz məni, qaldım əməlimdən; Çəkdim nə ziyanlıq*. M.Ə.Sabir. [Qurbanəli:] *..O ki qaldı qoyuna, keçiyə, onlardan da bir balaca ziyanlıq olub*. N.Vəzirov. [Həsən:] *Özüm də gəlib yatağın ziyanlığını yoluxacağam. Ziyanlığın hamısını* [Həzrətqulunun] *gözündən soyacağam*. Ə.Haqverdiyev.

**ZİYANLILIQ** b a x **zərərlilik**.

**ZİYANSIZ** 1. *sif.* b a x **zərərsiz**. *Ziyansız dərman. Ziyansız adam*.

2. *zərf* Heç bir zərərə, ziyana uğramadan; xətərsiz, xəsarətsiz, sağ-salamat. *Atılan oxlardan çıx gəl ziyansız; Namü nişanına qurban olduğum.* Ə.Cavad.

**ZİYANSIZLIQ** b a x **zərərsizlik**.

**ZİYANVERƏN** *sif.* Zərər gətirən, zərərverici. *Abşeronda çoxdan kökü kəsilmiş cana-*

*var, tülkü, çaqqal kimi ziyanverən heyvanlar haradansa peyda olub.* M.Rzaquluzadə.

**ZİYANVERİCİ** b a x **zərərverici**. *Ziyanvericilərlə mübarizə.*

**ZİYARƏT** *is.* [*ər.*] *köhn*. Hörmət əlaməti olaraq birini görməyə, biri ilə görüşməyə gəlmə; görüşə gəlmə; vizit. *Münəccimbaşı Mirzə Sədrəddin qibleyi-aləmin ziyarətinə müşərrəf olmaq istəyir bir vacib işdən ötrü*. M.F.Axundzadə. *İki ay bundan qabaq naçalnikdən izn alıb getmişdim kəndimizə anamın ziyarətinə*. C.Məmmədquluzadə. *Müsyö Qamel əvvəlinci ziyarətdə bu işlərin hamısına bələd oldu.* Qantəmir. ◻ **Ziyarət etmək** – görüşmək üçün yanına getmək, görüşünə getmək, görüşmək. **Ziyarətinə getmək** – görüşünə getmək. *Vəliəhd Gəncəyə gəldiyinin ikinci günü Qızıl Arslanın verdiyi məktubu da götürüb böyük şair Nizaminin ziyarətinə getdi*. M.S.Ordubadi. *Bir axşam nə olur olsun deyə, Nemət cənab Baxı ziyarət etməyə qərar verdi.* Çəmənzəminli. *Müsyö Qamel İsfahanda kimi ziyarət etməlidir, kimlə əlaqə və dostluq saxlamalıdır?* Qantəmir. [Yaqut] *gəlir-gedir, anasını ziyarət edir*. Ə.Məmmədxanlı; // *din*. Hörmət və xatırlama əlaməti olaraq müqəddəs sayılan yerləri, qəbirləri və s.-ni gedib görmə. *Rəsul ustasından izn alıb atasının qəbrini ziyarət etmək üçün qəbiristanlığa yollandı.* "Aşıq Qərib". *Göynüyün ətrafını Molla Cümə; Hər günü dörd yolla ziyarət eylər.* Molla Cümə. ◻ **Ziyarətə getmək** *din*. – müqəddəs sayılan yerləri və qəbirləri görməyə getmək. *İmama çox lazımdı ki, Ağa Sadıq kimi axmaqlar onun ziyarətinə getdi, ya yox*. C.Məmmədquluzadə. *Anlayanlar ziyarətə getmədi; Gedənlər də mətləbinə yetmədi*. Aşıq Mirzə. **Ziyarətinə getmək** – ziyarət etmək. *..Qonşu qadınlar Pirçinar ziyarətinə getməyə qərar vermişdilər*. S.Hüseyn. [Məşədi Mürsəl:] *Sən bu cansız daşları de ki, onlar da ağanın ziyarətinə yuvarlana-yuvarlana gedirlərdi.* T.Ş.Simurq.

◊ **Həm ziyarət, həm ticarət** – fürsətdən, təsadüfdən istifadə edərək, bir yerə gəlmişkən, ikinci xoş bir işi də görmək. *Həm ziyarət, həm ticarət, – deyə Əhməd fındıq dükanını ləğv edib və ələ gətirdiyi paraları arxalığının astarına tikib yola düşdü*. B.Talıblı.

**ZİYARƏTÇİ** *is.* Ziyarət edən adam, ziyarətə gedən (gələn) adam. *Qayıdan ziyarətçilər qəsəbədə qalanlardan əhvalatı təfərrüatı ilə öyrənmək istəyirlər.* Ə.Əbülhəsən. // *sif. məc.* Köçəri mənasında. *Qasımabadın çiçəkli tarlalarının yerində düzələn dəryada ziyarətçi quşların meyitləri üzürdü.* M.S.Ordubadi.

**ZİYARƏTÇİLİK** *is.* Ziyarət işi, ziyarət etmə.

**ZİYARƏTGAH** *is.* [*ər.* ziyarət və *fars.* ...gah] Ziyarət yeri, ziyarət üçün gedilən yer. [Şeyx Kəbir:] *Qapılıb hissə olmasan gümrah; Olacaq məqbərin ziyarətgah*. H.Cavid. *Bakının ətrafındakı kəndlərin bir qismində bir çox pirlər, ocaqlar, ziyarətgahlar vardı.* H.Sarabski. *Bu yerlər, bu qumlu, ağacsız, çiçəksiz torpaqlar hələ ta qədimlərdən belə yığın-yığın insanların ziyarətgahı idi*. Ə.Məmmədxanlı.

**ZİYİL** *is.* Dərinin üstündə əmələ gələn müxtəlif böyüklükdə düyüncüklər. ◻ **Ziyil tökmək** – çoxlu ziyil əmələ gəlmək, ziyillə örtülmək. [Həmzə dedi:] *O, necə deyərlər, qurbağalı gölməçələrdən su içməkdən dodaqlarım ziyil töküb*. "Koroğlu".

**ZİYİLCİK** *is.* Xırda, kiçik ziyil.

**ZİYİLDƏMƏ** "Ziyildəmək"dən *f.is.*

**ZİYİLDƏMƏK** *f.* Üşümək, soyuqdan titrəmək, tir-tir əsmək.

**ZİYİLLİ** *sif.* Ziyili olan, ziyillə örtülü olan. *Ziyilli qurbağa. Ziyilli əl*.

**ZİYİLLİLİK** *is.* Ziyilli olma, ziyil çıxarma, ziyillə örtülü olma.

**ZİYİLOTU** b a x **dəmrovotu**. *Ziyilotu və ya dəmrovotu köhnə daş divarlarda, meşə kənarlarında, əkinlərdə və zibilli yerlərdə bitən və narıncı süd şirəsi olan çoxillik otdur*. M.Qasımov.

**ZOD** *is. xüs*. 1. Metalları qaynaq yolu ilə bir-birinə yapışdırma, calama, birləşdirmə, qaynaq. // Metalda qaynaq, calaq yeri. // Metalı döyməklə uzatma.

2. *məc*. *dan*. Kəsər, təsir, itilik. *Ağzının zodu yoxdur*.

**ZODLAMA** "Zodlamaq"dan *f.is.*

**ZODLAMAQ** *f. xüs*. 1. Zod qoymaq, qaynaq yolu ilə calamaq (dəmiri).

2. Metalı döyməklə uzatmaq.

**ZODLU** *sif. dan*. 1. Zodu (1-ci mənada) olan. *Zodlu balta*. – *Gəldilər təzələr, ağzı*

*çox odlu; Kotan yaxşı qaçar olanda zodlu*. H.K.Sanılı.

2. *məc*. Kəsərli, ağzıodlu. *Zodlu* (z.) *danışmaq*.

**ZOĞ** *is.* Ağacda və başqa bitkilərdə yenicə cücərən göy qabıqlı incə budaqların hər biri; pöhrə. *Söyüdün zoğları*. // Ağacın və başqa bitkinin yer altındakı rişələrindən çıxan cücərti. *Kişi Xanpərini pambıq kolunun yanına aparıb içəridən qalxan bir zoğu göstərərək dedi*... Ə.Vəliyev. ☐ **Zoğ atmaq (vermək, etmək)** – yeni yaşıl qollar əmələ gəlmək. *Alma ağacı yaxşı zoğ atıbdır. – Yazın bu ayında xoş keçər illər; Zoğ edib rişədən baş verər güllər*. Aşıq Ələsgər. *Ağaclar yeni zoğ atır, yamaclarda yaşıl otlar göyərir*. M.İbrahimov.

**ZOĞAL** *is.* Yeməli, qırmızı meyvəsi olan bərk oduncaqlı ağac (kol). *Zoğal 5-6 metr hündürlükdə, qışda yarpağı tökülən kol və ya ağacdır. Sarı rəngli çiçəkləri mart-aprel aylarında yarpaqlanmadan əvvəl açılır. Meyvəsi sentyabrda yetişir*. H.Qədirov. // Bu ağacın xırda turş meyvəsi. *Zoğal çərdəyi. Zoğal mürəbbəsi* (*zoğaldan bişirilmiş mürəbbə*). *– Meşənin dəymiş əzgili saralar; Həm zoğal da dərilməyib qaralar*. A.Səhhət. *Oğul-uşaq zoğal, fındıq, moruq dərməyə gedərkən Kərim baba da sıradan qalmazdı*. A.Şaiq. *Almalar qızarır, armudlar, heyvalar saralır, əzgillə zoğal bir-birinə qarışırdı*. S.Rəhimov. ☐ **Zoğal axtası, axta zoğal** – tumu çıxarılaraq qurudulmuş zoğal. *Xalq batıbdır noğula, şəkərə, qəndə; Bizim evdə axta zoğal da yoxdur*. M.P.Vaqif.

**ZOĞALAŞI** *is.* Zoğal və ya zoğal qurusu ilə bişirilən aş.

**ZOĞALI** *sif.* Zoğal rəngində, tünd-qırmızı. *Zoğalı parça. – ..Vaqif isti kürkünü soyundu, nökərlərdən biri onun çiyninə zoğalı çuxasının üstündən samur xəzli ipək xirqə saldı, sonra içəri girdi*. Çəmənzəminli. *Doldular silaha onlar birtəhər; Hacının sevdiyi zoğalı kəhər; Aldı arxasına Qurban çobanı*. H.K.Sanılı.

**ZOĞALLIQ** *is.* Çoxlu zoğal ağacı bitən yer, zoğal ağacları bol olan yer.

**ZOĞLAMA** "Zoğlamaq"dan *f.is.*

**ZOĞLAMAQ** *f.* 1. Zoğ atmaq, zoğ vermək, ağacın kökündən zoğlar çıxmaq.

2. Yerə yeni kök atmaq.

**ZOĞLANMA** "Zoğlanmaq"dan *f.is.*

**ZOĞLANMAQ** *f.* Öz-özünə zoğ atmaq, cücərib çıxmaq, uzanmaq, boy atmaq; pöhrələnmək.

**ZOĞLU** *sif.* Zoğu, zoğları, pöhrəsi olan. *Zoğlu ağac*.

**ZOQQULDAMA** 1. "Zoqquldamaq"dan *f.is.*

2. *is.* Yaranın, çibanın irinləməyə, yetişməyə başladığı zaman dərin və bərk ağrıması, sancması, göynəməsi.

**ZOQQULDAMAQ** *f. dan*. 1. İrin, çirk etməyə yaxın bərk ağrımaq, sancmaq, göynəmək (yara). *Çibanım zoqquldayır. – Bala-qardaş, .. canım sənə qurban, o zəhrimarı tezcə gətir, yoxsa ürəyimin ortası zoqquldayır*.. N.Vəzirov. [Mürsəl] *ufuldayırdı, çünki yarası zoqquldayırdı*. Ə.Vəliyev.

2. *məc*. İnləmək, inildəyə-inildəyə ağlamaq acı-acı ağlamaq. *Bəxti də bu zaman zoqquldayıb ağlamışdı*. S.Rəhimov.

**ZOQQULTU** *is.* Davamlı, bərk və dərin ağrı, sancı, bərk sızıltı (b a x **zoqquldama**). [Bəyin] *gicgahlarından qalxan zoqqultu ona əziyyət verirdi*. Ə.Vəliyev.

**ZOL**[1] 1. *sif.* Uzun zolaq şəklində olan, zolaq şəklində kəsilmiş. *Zol gön. Zol taxta*. // *is.* Zolaq şəklində kəsilmiş gön, dəri və s. // *is.* Ağacın gövdəsindən qoparılan zolaqşəkilli qabıq.

2. *is.* Zolaq. // Şüy çubuq, qayış zərbəsinin dəydiyi yerdə buraxdığı iz. *Zolların yerində qan görünməyə başladı*. M.S.Ordubadi. ☐ **Zol çıxarmaq (çəkmək, qaldırmaq)** – şüy çubuq, qayış və s. buna bənzər şeylərlə vurub bədəndə zolaq kimi iz buraxmaq. *Ey ariflər, İsfahanda; Bir dəllək var, zol çıxardır*. Xəstə Qasım. *Nazik çubuq hər dəfə tappıltı ilə* [Laçına] *dəyəndə, dərisində zol qaldırırdı*. M.Hüseyn.

**ZOL**[2] *zərf* 1. *dan*. Düz, birbaş. *Zol getdim şikayətə*.

2. Arasıkəsilmədən, həmişə, daima, tez-tez. *Zol fikir içindədir. Zol şikayət edir*. – [Rüstəm] *gördü ki, burada bir cavan pəlvan əyləşibdir. Amma heç kimnən gülüb-danışmır, hey başın salıb aşağı, zol fikirdədir*. (Nağıl). [Səfər bəy:] *Yaxşı! Yaxşı! Axund, bu Qənbərqulu maşın kimi bir şeydir, bir kərə ki, vintini burdun, daha zol danışacaq*. B.Talıblı.

**ZOLA** *is. dan*. Uzun nazik ağac, düz dirək. *Çardağın böyründən bir zola qoymasaq, uçacaq*. // Uca ağaclardan meyvə çırpmaq üçün uzun, düz, nazik ağac. *Zola ilə tut çırpmaq. – Uşaq zolanı əydi. Bu, uzun, hamar bir ağacdı*. P.Makulu. // Çox yekə ağac.

**ZOLAQ** *is*. 1. Bir endə olan uzun forma, bir şeyin bir endə olan dar, uzun parçası. *Dəmir zolağı. Kağız zolağı*.

2. Enli xətt. *Abı zolaqları olan parça. Ağsarı zolaqları olan divar kağızı. Parçada qırmızı zolaqlar.* // Bir şeyin buraxdığı uzun, ensiz iz; xətt; zol. *İşıqlanıb al zolağı; Parlayanda göy qurşağı; Birnəfəsə çıxdıq dağı*. M.Dilbazi.

3. Bir sahənin, səthin və başqa bir şeyin ümumi fon üzərində hər hansı bir əlaməti ilə fərqlənən uzanmış hissəsi. *Qara tüstü zolaqları. – ..Dan yeri sökülməyə başlayır, içəriyə işıq zolaqları süzülürdü*. M.Hüseyn. *Bu qaranlığı haradansa düşən Ay işığının zolağı ikiyə parçalamışdı.* Ə.Məmmədxanlı.

4. Bir şeyin uzanıb gedən qismi; qurşaq, zona, sahə. *Qaratorpaq zolağı. Səhra zolaqları. Sahilin qumlu zolağı. – Yolumuz .. təzə salınmış meşə zolaqları arasından keçirdi.* M.Dilbazi.

5. *köhn.* Kolxozlar təşkil olunmadan əvvəl: kənd torpağının ayrı-ayrı kəndliyə məxsus olan dar şum sahəsi.

**ZOLAQARASI** *sif.* Zolaqlar arasında olan. *Meşə zolağı havanın hərarətinin zolaqarası tarlada da aşağı olmasına kömək edir.* Q.Gül.

**ZOLAQLI** *sif.* Üzərində zolaqları olan, zolaq-zolaq. *Üstü zolaqlı qovun. Zolaqlı bəbir*. // Üzərində müvazi xətlər, cizgilər olan. *Zolaqlı parça. Çitin qara zolaqları var.* – [Əsəd] *üzü təmiz qırxılmış, püsteyi rəngdə köynək geyib qırmızı zolaqlı qalstuk bağlamışdı*. Ə.Sadıq.

**ZOLAQ-ZOLAQ** *sif.* Zolaqlar şəklində olan. *Zolaq-zolaq tarlalar. – Qurtuluş güllələri zolaq-zolaq qızartdı havanı.* R.Rza. // Üzərində zolaqlar olan. *Zolaq-zolaq parça. Zolaq-zolaq palaz. Zolaq-zolaq döşək. Zolaq-zolaq zürafə. Zolaq-zolaq özbək xələti.* – [Qaragünənin] *başının üstündən, divarda zolaq-zolaq bir pələng dərisi, üzərində mal damarından hörülmüş qaba bir qamçı .. asılmışdı*. M.Rzaquluzadə. [Zeynal] *zolaq-zolaq xəstəxana pijamasının altında yavaş-yavaş barmaqlarını tərpədirdi*. B.Bayramov. // *Zərf mənasında*. Zolaqlar şəklində. *Böyrü qırmancdan zolaq-zolaq olmuş yabı. – Köynəyinin üstündən də mümkündür saymaq; Qırmanclanmış zolaq-zolaq qabırğaları*. S.Rüstəm.

**ZOLLAMA[1]** "Zollamaq[1]"dan *f.is.*

**ZOLLAMA[2]** "Zollamaq[2]"dan *f.is.*

**ZOLLAMAQ[1]** *f. dan*. Zolaqlar şəklində kəsmək, zol-zol etmək. *Gönü zollamaq.*

**ZOLLAMAQ[2]** *f. vulq*. 1. Uzun, möhkəm bir şeylə bərk vurmaq, ilişdirmək, çəkmək. *Dəli şeytan deyir ki, bir dəyənək; Mollanın zolla başına zirək.* S.Ə.Şirvani. [Atakişi:] *Bir yol Ditdili Həsənin gündəyməzindən bir ağac zolladım ki, iki ay sümüklərinə yağlı xəmir saldılar.* C.Cabbarlı. *Dava qızışan kimi hər kəs əyilib öz başmağını çıxarıb əlinə alar və bir-birinin sir-sifətinə zollayardı*. Qantəmir.

2. Yararsız bir şey kimi atmaq, tullamaq. *Ah, o saətdən lüt eylər mürdəşir əndamüvi; Taxta üstündə yuvar, tabutə zollar canüvi.* M.Möcüz.

**ZOLLANMA** "Zollanmaq"dan *f.is.*

**ZOLLANMAQ** *məch*. *vulq*. 1. Bərk vurulmaq, ilişdirilmək, döyülmək.

2. Yararsız bir şey kimi atılmaq, tullanmaq.

**ZOLLATMA** "Zollatmaq"dan *f.is.*

**ZOLLATMAQ** b a x **zollamaq**[2]. *Qəflətdə yatıb, ad batırıb, nam alırız biz; Başa yumruq zolladırız, kam alırız biz*. M.Ə.Sabir.

**ZOLOTNİK** *is.* [*rus*.] Buxar maşınlarında buxarpaylayıcı mexanizm.

**ZOL-ZOL[1]** *sif.* Zollar, zolaqlar şəklində olan. // Üzərində zolaqlar olan. *Zol-zol parça.* ◻ **Zol-zol etmək** – 1) b a x **zol çəkmək** ("**zol[1]**"də); 2) zolaqlar şəklində izlər əmələ gələnə qədər qırmanc, şüv və s. ilə vurmaq. *Əndamını zol-zol elədi*. // *Zərf mənasında*. Zolaqlar şəklində, zolaq kimi. *Döşəyi, yorğanı zol-zol cırdılar; Zolaqları kəndir kimi burdular*. H.K.Sanılı. [Kəyan Hacıyevin] *gözləri bir az şişmişdi, üzündə bir neçə barmağının yeri zol-zol dururdu*. Ə.Əbülhəsən.

**ZOL-ZOL[2]** *zərf* Tez-tez, arasıkəsilmədən, mütəmadiyən. *Zol-zol baxmaq*.

**ZOM** *is. məh*. Arxın içindən bellə alınıb kənarlarına qoyulan sulu palçıq. *Zom vurmaq.*

**ZOMLAMA** "Zomlamaq"dan *f.is.*

**ZOMLAMAQ** *f. məh*. Arxın içindəki palçığı bellə götürüb bənd şəklində kənarlarına yığmaq, bənd vurmaq. *Arxı zomlamaq.*

**ZÓNA** [*yun*.] Hər hansı bir ümumi əlamətinə görə səciyyələnən müəyyən ərazi sahəsi; qurşaq, rayon. *Arktik zona. Subtropik zona. Meşə zonası. Sərhəd zonası. Respublikamızın əsas çay zonası Lənkəran – Astara rayonlarıdır. Qarabağ atının vətəni və əsas yayıldığı yerlər Qarabağ zonası olmuşdur. – Xəzərin sahili, xoş gəzməli zonası da var...* R.Rza.

**ZONAL** *sif.* [*yun*.] Zonaya aid olan, zona ilə əlaqədar olan, müəyyən zona üçün səciyyəvi olan. *Zonal bitkilər. – Boz torpaqlar Qarabağ düzünün aran hissəsi üçün əsas zonal torpaqlar hesab olunur.* S.Salayev.

**ZONALLIQ** *is.* [*yun*.] *xüs*. Zonalar üzrə yerləşmə, qurşaqlar üzrə yerləşmə. *Torpağın zonallığı. – Kiçik Qafqaz sıra dağ sistemi şaquli zonallıq qanununa tabe olan xüsusiyyət yaradır*. S.Salayev.

**ZOND** [*fr*.] 1. Orqanların, toxumaların daxilini tədqiq etmək üçün onların içinə yeridilən borucuq və ya çubuq şəklində tibb aləti. *Mədəyə zond salmaq*.

2. Torpağın dərin qatlarını yoxlamaq və nümunələr götürmək, habelə quyu qazımaq üçün burğu.

3. Atmosferin yüksək qatlarında meteoroloji işlər aparmaq üçün içərisində avtomatik yazma cihazı olan kiçik hava balonu.

**ZONDLAMA** "Zondlamaq"dan *f.is.*

**ZONDLAMAQ** *f.* 1. Zond (1-ci mənada) salmaq.

2. Zond (3-cü mənada) buraxmaq.

**ZÓNTİK** [*rus.* əsli *holl.* zonnedek-dən] Yağışdan, gündən qorunmaq üçün üzərinə parça çəkilmiş millərə bənd edilmiş açılıb-bükülən əl ağacı şəklində alət; çətir, günlük, yağmurluq. *Əlində zontik tutmaq. Zontik açmaq. – Pəncərənin birində açıq qadın zontiki qoyulmuşdu*. S.Rəhman.

**ZONTİKLİ** *sif.* Başına zontik tutmuş, əlində zontik olan. *Zontikli kişi. – Zontikli qadınlar alçaq çadır kimi görünürdülər*. Mir Cəlal.

**zoo**... [*yun*. zoon] – mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, heyvanlar aləminə mənsubiyyət, yaxud sözün heyvana aid olduğunu bildirir; məs.: zoobaytarlıq, zoogigiyena, zoopsixologiya, zoocoğrafiya, zoopark, zoostansiya.

**ZOOBAYTAR** *is.* [*yun*. zoon və *ər*. bəytər] Kənd təsərrüfat heyvanlarının yetişdirilməsi, bəslənməsi, saxlanması və onlardan düzgün istifadə olunması sahəsində çalışan mütəxəssis. *Zoobaytar nəzarəti.*

**ZOOBAYTARLIQ** *sif.* Kənd təsərrüfat heyvanlarının yetişdirilməsinə, bəslənməsinə, saxlanmasına və onlardan düzgün istifadə olunmasına, habelə onların müalicəsinə aid olan. *Zoobaytarlıq şəbəkəsi. Zoobaytarlıq institutu. Zoobaytarlıq tədbirləri. Zoobaytarlıq tələbləri.*

**ZOOCƏRRAHLIQ** *is.* [*yun*. zoon və cərrahlıq] Heyvanlar üzərində cərrahlığa aid elm. *V.İ.Vsevolodov* (*1790-1863*) *zoocərrahlığa .. dair əsərlərin müəllifi olmuşdur.* "Ümumi zootexniya".

**ZOOGİGİYÉNA** [*yun*. zoon və hygieinos – şəfaverici] Heyvanların sağlamlığını qoruma şəraiti və tədbirləri haqqında elm.

**ZOOGİGİYENÍK** *sif.* [*yun.*] Zoogigiyenaya aid olan, zoogigiyena ilə əlaqədar olan. *Zoogigiyenik tədbir. Zoogigiyenik qayda.*

**ZOOLÓGİYA** [*yun*. zoon və logos – elm, anlayış] Heyvanlar aləmindən bəhs edən elm.

**ZOOLOJÍ** *sif.* [*yun*.] 1. Zoologiyaya aid olan. *Zooloji muzey.*

2. *məc*. Heyvani, qaba.

**ZOÓLOQ** [*yun*.] Zoologiya (heyvandarlıq) mütəxəssisi.

**ZOOPÁRK** [*yun*. zoon və *ing*. park] Heyvanat parkı, zooloji park. *Gah zooparkda gəzirəm səllimi; hər cürə heyvan görürəm, qorxmuram.* R.Rza.

**ZOOTÉXNİK** [*yun.* zoon və techne-dən] Zootexniya mütəxəssisi. *Kəndin müəllimləri, kolxozun briqadirləri, zootexniki, aqronomu həmişə üzlərini Səməd Bayramlıya qırxdırırdılar..* M.Hüseyn. *Aqronom, baytar, zootexnik, mühəndis, yerölçən yeni kəndin tərəqqisi uğrunda ciddi işə girişdi.* Ə.Vəliyev.

**ZOOTÉXNİKA** [*yun*. zoon və techne] Heyvandarlıq elmi; kənd təsərrüfat heyvanlarının yetişdirilməsi, saxlanılması və onlardan düzgün istifadə üsullarından bəhs edən elm.

**ZOOTEXNÍKİ** *sif.* [*yun.* zoon və techne-dən] Zootexnikaya aid olan. *Zootexniki laboratoriya. Zootexniki qaydalar.*

**ZOOTÉXNİYA** b a x **zootexnika**. *Zootexniyada qaramalın bədən quruluşu ilə birlikdə eksteryeri, yəni bədənin xarici görünüşü də öyrənilir.* "Qaramal".

**ZOPA** *is. dan.* Dəyənək, kötək. *Molla da əlinə bir yekə zopa alıb onu qova-qova çığırır.* "M.N.lətif." [Helmi:] *Mən gəlincəyə qədər bunların hər birisinə yüz zopa vurulmasını əmr edərsiniz.* M.S.Ordubadi. *Mirzə Süleymana zopa vuracaqlar.* B.Talıblı.

**ZOPALAMA** "Zopalamaq"dan *f.is.*

**ZOPALAMAQ** *f. dan.* Zopa ilə döymək, kötəkləmək.

**ZOPALANMA** "Zopalanmaq"dan *f.is.*

**ZOPALANMAQ** *məch. dan.* Zopa ilə döyülmək, kötəklənmək.

**ZOPALATMA** "Zopalatmaq"dan *f.is.*

**ZOPALATMAQ** *icb.* Zopa ilə döydürmək, kötəklətmək.

**ZOPU** *is. etnoqr.* Keçmişdə toylarda cavanların cərgə ilə durub uzun çubuqla oynadıqları bir oyun.

**ZOR** [*fars.*] 1. *is.* Güc. *Muzdur anladı ki, çox pulun zoru da çox olurmuş.* S.M.Qənizadə. [Mirzə Həsən:] *Bundan sonra traktor adlanan maşının zoru ilə əkəcəksiniz.* Ə.Haqverdiyev. [Harun:] *Düşmənin zoru qabağında könül xof eyləməz.* Ü.Hacıbəyov. ☐ **Zor etmək (eləmək)** – güclə məcbur etmək, güc tətbiq etmək. [Məhərrəm:] *Odur ki,* [Səriyyəyə] *zor etməyə haqqınız və ixtiyarınız yoxdur.* C.Cabbarlı. **Zor gəlmək** – üstün olmaq, qalib çıxmaq, məcbur etmək. **Zor ilə** – 1) zorla. *Mən səndən ayrılmazdım; Zor ilən ayırdılar.* (Bayatı). *Naəhl olana mətləbi andırmaq olurmu?! Söz qanmıyana zor ilə qandırmaq olurmu?!* M.Ə.Sabir. *Mexaniki zor ilə maşınxanadan kənara çıxardılar.* H.Nəzərli; 2) var gücü ilə. *Keçmiş kösöyü zor ilə yerə vuranda qığılcım saçılan kimi* [dərvişin] *gözləri məşəlləndi.* A.Divanbəyoğlu. **Zor işlətmək (göstərmək)** – zor etmək, gücdən istifadə etmək, zorakılıq etmək. [Vahidov Telliyə dedi:] *Bəzən zor işlətmək lazımdır ki, sevdiyin adamı xoşbəxt edəsən.* Ə.Məmmədxanlı. **Zora çəkmək** – çətinliyə salmaq, bərkə çəkmək, məcbur etməyə çalışmaq. *Boşla, ay molla dayı, sən də bizi çəkmə zora; Biz sənin hiylən ilə düşmərik əsla bu tora.* M.Ə.Sabir. **Zora salmaq** – çətinliyə salmaq, gücə salmaq. *Molla dartındı, ancaq qolunun mənganəyə düşdüyünü görüb zora salmadı.* S.Rəhman. **Zoruna dönüm!** – tərif və təşviq ifadəsi (birinə ürək vermək, bir işə cəsarətləndirmək və təhrik etmək üçün işlənir). *Qüvvətlə sıx döşünə tüfəngin qundağını; Vur, zoruna dönüm, vur, baş qaldıran yağını!* R.Rza. // Qolugüclülük, qolunun gücü. **Zor vermək** – 1) güc vermək. [Aslan bəy:] *Xoş gəldin, get ancaq bundan sonra ağlına zor vermə...* N.Vəzirov; 2) ağır təsir etmək. *Ayrılıq zor verdi ana qəlbinə; Gəl! – deyib yanına çağırdı yenə.* S.Vurğun.

2. *sif.* Çox güclü, qüvvətli, böyük. *Açarın gücü qıfıldan zordur.* (Ata. sözü). [Paşa Qəribə:] *Mən bilirəm sən qəribsən, ancaq deyirlər ki, çox zor aşiqsən.* "Aşıq Qərib". // Çox bacarıqlı, qoçaq, əlindən hər şey gələn. *Kişi zor adamdır.* // *zərf* Çox, xeyli. [Rüstəm bəy:] *Çingiz, nə çox yatmışıq, balam? – dedi, – zor yatdıq.* Çəmənzəminli.

3. *sif.* Çətin, çətin başa gələ bilən, zehni və yaxud cismani güc tələb edən, çox ağır. *Zor məsələ. – Müqim bəy .. sabahkı işin çox zor iş olduğunu kəsdirdi, təkrarən öz nitqini nəzərdən keçirməyə başladı.* S.Rəhimov. // **Zordur** şəklində – çox çətindir. *Uff, .. bu qədər məşəqqətdən sonra ona yaxınlaşmaq yenə də zordur, – dedi.* H.Nəzərli.

4. *is.* Məcburiyyət. *Mənim yetim uşağa rəhmim gəlir, çünki o uşaq sahibsizdir və bu barədə dəxi mənə zor yoxdur.* C.Məmmədquluzadə. [General:] *Xoşluqla etməsə, nə gəlib zora? Biz ki, gəlməmişik xoşluqla bura.* B.Vahabzadə. // *Zərf mənasında.* Məcburiyyət altında, məcburən, istəmədən, öz xahişi olmadan. *..Tacir yarı zor, yarı xoş hambalı padşahın yanına apardı.* (Nağıl).

5. **Zorla** şəklində *zərf* – 1) güc işlədərək (işlədilərək), güc tətbiq edərək (edilərək), məcburiyyət altında. *Qızı gətirdilər saraya zorla; Hər şeyi sarayda anladı Leyla.* B.Vahabzadə; // istəməyə-istəməyə, özünü məcbur edərək. [Əlləzoğlu] *sifətini eybəcər bir şəklə saldı, qədəhin az qala yarısını zorla püstə ağzına təpdi.* İ.Hüseynov; 2) çox çətinliklə, güclə. *Özünü zorla çəkib aparan*

*qoyunların yelini südlə dolu idi*. M.İbrahimov. *Ancaq tüfəng çox uzun və ağır olduğundan onun əli tətiyə zorla çatırdı*. M.Rzaquluzadə; 3) güclə, güc-bəla ilə, çox çətinliklə (bu mənada bəzən "zor-bəla ilə" şəklində işlənir). *İşin öhdəsindən zorla gəldi. Zorla özünü saxlaya bildi. Onu zor-bəla ilə razı sala bildilər.*

**ZORAKI** *sif.* Zor gücü ilə həyata keçirilən, zorla olan, zora istinad edən. *Zorakı çevriliş. Zorakı tədbir. Zorakı assimilyasiya.*

◊ **Zorakı ölüm** *hüq*. – zor nəticəsində baş verən ölüm, qətl (*təbii ölüm qarşılığı*).

**ZORAKILIQ** *is.* 1. Zor tətbiqi, zor işlətmə; zor vasitəsi ilə məcburiyyət. *İş zorakılıq məsələsinə gəlirsə, bizimkilər oradadır, qorxmayın.* M.S.Ordubadi. *..Cəbhələrin birisinin bayrağı azadlıq və zəhmət, o birisinin bayrağı zorakılıq və ağalıq idi*. M.İbrahimov.

2. Qolugüclülük, zorla məcbur etmə; zor gücü ilə görülən iş; zülm, qanunsuzluq, özbaşınalıq, haqsızlıq. *Bizim hüquq elmi hər hansı zorakılığın, haqsızlığın əleyhinədir!* S.Rəhimov. *Kamilin verdiyi təsəlli* [Biqəmi] *ruhlandırırdısa da, gördüyü zorakılıq və yediyi ağır kötəkdən ədalətin ola biləcəyinə inana bilmirdi*. M.Süleymanov. ◻ **Zorakılıq etmək** – 1) zora əl atmaq, zor işlətmək, zorla məcbur etmək, qaba qüvvə tətbiq etmək; 2) tabe olmamaq, inad göstərmək, höcət eləmək. [Kərbəlayı] *Ədə, hökumət ilə zorakılıq eləmək olar?* H.Nəzərli.

**ZORBA** *sif.* 1. Çox iri, çox yekə, çox böyük. *Zorba ayı. Zorba canavar. Zorba ilan. Zorba daş. – Zorbadır hərçənd ki, qəddin sənin; Yox mənə tay olmağa həddin sənin*. M.Ə.Sabir. [Nisə xala] *pilləkənin altında yatan zorba bir qoyun itinin boğazına ayağını basıb bizə dedi.* Qantəmir. // *dan*. Ümumiyyətlə böyük. [Axund:] *Bu nikah kəsməkdən və ya kəsdirməkdən zorba savab yoxdur, ələlxüsus, siğə ola.* C.Cabbarlı.

2. *məc*. Çox böyük, çox nüfuzlu, görkəmli (adətən kinayə yolu ilə deyilir). *Şuşa şəhərinin lap zorba mollalarının bu soyuqda .. bu otuz-qırx verst yolu gəlməkdən mənzurları nə imiş?* "Mol. Nəsr." // İs. mənasında. *..Zorbaların zülm və istibdadına bir nəhayət vermək .. məqsədi ilə şəhərin "ağa"ları .. bir "cəmiyyət" düzəltdilər*. S.Hüseyn.

3. *məc*. Çox güclü, çox qüvvətli, çox böyük. *Mübarizə apardığımız qüvvələr zorbadır*. M.S.Ordubadi.

**ZORBACA** *sif.* Çox zorba. *Canlıcadır, zorbacadır baldırım; Sındıra bilməz məni heç ildırım*. M.Ə.Sabir.

**ZORBALANMA** "Zorbalanmaq"dan *f.is.*

**ZORBALANMAQ** *f. dan*. Çox böyümək, zorba olmaq, çox böyüyüb artmaq, yekələnmək, şişmək. *Gündə on şahı ilə cümlə ümuri adlanır; Bu vücudin ki, dəmadəm əməli zorbalanır.* M.Ə.Sabir.

**ZORBALAŞDIRILMA** "Zorbalaşdırılmaq"dan *f.is.*

**ZORBALAŞDIRILMAQ** *məch*. Çox böyüdülmək, yekələşdirilmək, iriləşdirilmək.

**ZORBALAŞDIRMA** "Zorbalaşdırmaq"-dan *f.is.*

**ZORBALAŞDIRMAQ** *f. dan*. Zorba hala salmaq, çox böyütmək, çox böyüdüb artırmaq, yekələşdirmək, iriləşdirmək.

**ZORBALAŞMA** "Zorbalaşmaq"dan *f.is.*

**ZORBALAŞMAQ** *f. dan*. Çox böyümək, çox yekəlmək, həddindən artıq şişmək, zorba olmaq. *Günlər keçdi, aylar keçdi, balaca Cəbi yavaş-yavaş boy atırdı, fəqət həmişə zəif, üzü kiçik, başı isə günbəgün zorbalaşırdı*. N.Nərimanov.

**ZORBALIQ** *is. dan*. 1. Yekəlik, irilik, böyüklük; zorba şeyin halı. *Başladı tərifə palıd qamətin; Öydü özün, zorbalığın, halətin.* M.Ə.Sabir. *Yusif Qaraca qızın tərsliyinə təəccüb edib arvadına deyərdi: – Bu zorbalıqda ayı mənim qamçımın qorxusundan hər cür oyun çıxarır, amma bu balacalıqda qızın əlində aciz qalmışam*. S.S.Axundov.

2. *məc.* b a x **zorbazorluq**. *Hər yerdə, hər mühitdə haqsızlığın, qolugüclülüyün, zorbalığın əleyhinə çıxışlar olurdu.* S.Hüseyn.

**ZORBAZOR** *is.* Zalım, zülmkar, qolugüclü, zorakılıq edən, başlı-başınalıq edən adam. *Qoymuyublar başımızın üstünü kəsən minlərlə zorbazorların zülmlərindən bəhs edək.* C.Məmmədquluzadə.

**ZORBAZORLUQ** *is.* Qolugüclülük, zorakılıq, başlı-başınalıq, qaba qüvvə; haqsızlıq, qanunsuzluq. ◻ **Zorbazorluq etmək** – kobudca qüvvə tətbiq etmək, zorakılıq etmək, zor işlətmək, başlı-başınalıq etmək, qol gücü ilə iş görmək.

**ZOR-BƏLA: zor-bəla ilə** – zorla, güclə, çox çətinliklə. *Rəşid zor-bəla ilə balığı tutub, vedrəyə qoydu..* M.Süleymanov.

**ZOR-GÜC** *zərf* Zorla, güclə, zor-bəla ilə (bəzən "zor-güclə" şəklinlə işlənir). *Şah Daşküvar əlacı kəsilib dedi: – Razıyam. Yeddi gün, yeddi gecə toy eləyib, vəzirin qızını zor-güc alıb, verdi Adamzada..* (Nağıl). *Kəndlilər zor-güc bu heyvanları itlərin pəncəsindən qurtara bildilər.* A.Şaiq. *Yox, ağ günü mütləq aramaq, onu zor-güclə çəkib gətirmək gərəkdir!* S.Rəhimov. // Çox çətinliklə, əziyyətlə, məşəqqətlə, birtəhər. *Zor-güc dolanır.* – [Tahir:] *Mən də iki-üç günlüyünə zor-güc izin almışam*. M.Hüseyn.

**ZORXANA** *is.* [*fars.*] *köhn*. Keçmişdə: ağır idman məşğələləri və yarışları keçirilən yer, bina. *Bundan sonra bir ayrısı başlayırdı: – Rəhmətlik xanın mənnən də arası kök idi. Zorxanada işləyəndə xan da bizimlə işləyirdi*. Çəmənzəminli. *Zorxanaya kim yazılsaydı, gərək hər gün oyuna gələydi*. H.Sarabski.

**ZORLAMA** 1. "Zorlamaq"dan *f.is.*

2. *zərf* Zorla, güclə, zor işlədərək.

**ZORLAMAQ** *f.* 1. Zorla bir işə məcbur etməyə çalışmaq, zora salmaq, zorla boynuna qoymaq. *Gülyaz Səmədi, heç olmazsa, rəsmi bir ər kimi istəmək üçün könlünü nə qədər zorlayırdısa da, bir nəticə çıxmırdı.* M.Hüseyn. [Nəriman:] *Mənim qəlbimi zorlamaq fikrinə düşmədi*. Mir Cəlal.

2. *məc*. Zorla cinsi əlaqəyə məcbur etmək, zorla əlaqədə olmaq, namusuna toxunmaq.

3. Zorla açmaq, gücə salaraq açmaq; güc gəlmək. *Onlar nə hökumət qapısını, nə də sizin evin qapısını zorlayıb içəri girə bilməzlər*. M.S.Ordubadi. *Axund qapını zorlamağa başladı.* S.Rəhman. // Güc gəlmək, zorakılığa salmaq, güc eləmək, zor etmək. *Sonra hər kəs gəldi, zorladı, girdi içəri*. C.Məmmədquluzadə.

**ZORLANMA** "Zorlanmaq"dan *f.is.*

**ZORLANMAQ** 1. *f.* Güclənmək, qüvvətlənmək.

2. "Zorlamaq"dan *məch*.

**ZORLAŞMA** "Zorlaşmaq"dan *f.is.*

**ZORLAŞMAQ** b a x **zorlanmaq** 1-ci mənada.

**ZORLATMA** "Zorlatmaq"dan *f.is.*

**ZORLATMAQ** *icb*. Başqasının vasitəsi ilə zorla bir işə məcbur etmək.

**ZORLU** *sif.* 1. Güclü, qüvvətli. *Yaman zorlu adamdır. – Qüvvətli olsan da, yoxsulu döymə; Demə ki, zorluyam, qolum yaxşıdır.* Xəstə Qasım. *Həmin fələkzadə Məşədi Əsgər qırx yaşında, qısaboylu, amma çox zorlu bir kişi idi.* S.M.Qənizadə. *Tez çatsın əlimiz bərkə düşərsək; Zorlu qoşun ilə biz görüşərsək.* H.K.Sanılı.

2. *məc*. Sözü keçən, nüfuzlu, hökmü olan. [Pərzad] *Əh, o boş sözdür, əmim dövlətli, zorlu kişidir*. M.F.Axundzadə. // İs. mənasında. [Ceyniz:] *Saray istibdadı, zorluların əmlak iştahası xalqı zara gətirmişdir*. Çəmənzəminli.

**ZORLUQ** *is.* Çətinlik, ağırlıq. *Hacı Vəlinin müəyyən prinsipləri var idi. Şeyləri zorluqla* (z.) *qəbul edərdi..* Çəmənzəminli.

**ZORLULUQ** *is.* Zorlu olma, qüvvətlilik, güclülük.

**ZORRAMA** *dan.* b a x **zorlama** 2-ci mənada. *İbrahim bu səfər genə birtəhər zorrama balığı buraxdırdı.* (Nağıl).

**ZORSUZ** *sif.* Gücsüz, qüvvətsiz, arıq. *Zorsuz adam.*

**ZÖHD** *is.* [*ər.*] *klas*. Dinin qadağan etdiyi şeylərdən çəkinərək vaxtını ibadətə sərf etmə; pəhrizkarlıq (bəzən "zöhd və təqva", "zöhdü təqva" şəklində işlənir). *Mey gətir, saqi, məni qurtar namazü rövzədən; Kim, mən ol zöhdü riyadan tövbəkarəm, doğrusu.* Kişvəri. *Vaqifa, səndə ki yoxdur, bilirəm, zöhdü riya*. M.P.Vaqif. [Vidadi:] *Bu fani dünyanı zöhd və təqva ilə keçirmək daha yaxşı olmazdımı?* Çəmənzəminli. ☐ **Zöhd əhli** *klas*. – dünyanın zövq və nemətlərindən əl çəkib vaxtını ibadətdə keçirən adam. *Bağlamış zöhd əhlinə qapusunu meyxanənin; Hörməti lazım gərək, hərçənd kafirdir qonaq.* Qövsi. *Ayağın bassa saqi başim üzrə canə minnətdir; Neçin zöhd əhlindən bir dərdməndə xeyrü şər gəlməz*. Q.Zakir.

**ZÖHR** *is.* [*ər.*] Günorta. *Elə isə sabah zöhr zamanı məni Qəsafə cameyinin qarşısında gözləyin*. M.S.Ordubadi. *Günortaya yaxın zöhr namazının vaxtı olduğu üçün qaladan azan səsi eşidilərdi*. H.Sarabski.

**ZÖHRƏ** *is.* [*ər.*] 1. *astr*. Günəş sisteminə daxil olan yeddi ulduzdan biri və bütün

görünən ulduzların ən parlağı; Karvanqıran, Venera.

2. *məc.* Eşq ilahəsi (klassik poeziyada adətən gözəllik rəmzi kimi "Zöhrə ulduzu" şəklində işlənmişdir). *Şəşəəsində məhv olur ay ilə gün bu gün Zöhrənin; Gör ki, nə aftabmış şol fələkin sitarəsi.* Nəsimi. *Müştəridir sənə Zöhrə fələkdə; Gecə-gündüz övsafını deməkdə.* Q.Zakir. *Susun artıq! Bu Zöhrə ulduzunu seyr edin iştiyaqü həsrət ilə; Bu gözəl lövhə sonra düşməz ələ.* H.Cavid. *Zöhrə ulduzuna məftun olmuşsan; Sürürsən üstünə öz təyyarəni.* S.Vurğun.

**ZÖHRƏOTU** *is. bot.* Qarşı-qarşıya yerləşmiş yarpaqları olan çoxillik zəhərli bitki (yarpaqlarından və gövdəsindən göy rəng hasil edilir).

**ZÖHRƏVİ** *sif.* [*ər.*] *tib.* Əksər hallarda cinsi əlaqə ilə keçən. *Zöhrəvi xəstəlik.*

**ZÖKƏM** *is.* [*ər.*] Burnun daxili qişasının iltihabı nəticəsində burundan selik axma və tez-tez asqırma şəklində təzahür edən xəstəlik. *Zökəm olsa əgər bizim qəhrəman; Şeir uzaqlaşar onun yanından.* M.Rahim. *Qızdırmadan, zökəmdən zara gəlib adamlar.* H.Hüseynzadə.

**ZÖKƏMLİ** *sif.* və *is.* Zökəm olmuş, zökəm xəstəliyinə tutulmuş (adam).

**ZÖVC** *is.* [*ər.*] *kit.* Kişi, ər. *Demək, Mahmudun atası Allahın rəhmətinə vasil olandan hənuz zövq ixtiyar etməyibsən.* P.Makulu.

**ZÖVCƏ** *is.* [*ər.*] *kit.* Arvad, həyat yoldaşı, qadın. *Taleyin varmış, əzizim, Jasmen! Daha dilbərdir ölən zövcəndən.* H.Cavid. *Getdi ağlım mənim əyyami-cavanlıq dəminə; Ki nədir, mən dözərəm zövcələrin hər qəminə...* Ə.Nəzmi. [Əbdüləli bəy:] *Ancaq Gülüş xanım, sizin yadınızdadırmı, 7-8 il bundan qabaq Mirzə Balaşın bir zövcəsi var idi, o nə oldu?* C.Cabbarlı.

**ZÖVQ** *is.* [*ər.*] 1. Hər hansı bir xoş təəssüratdan duyulan sevinc hissi, məmnunluq hissi; ləzzət, həzz, nəşə. *Sən mükafatını insanlığa xidmətində ara; Əbədi zövq, təsəllini həqiqətdə ara.* A.Səhhət. *Həm zövqüdür, həm cövrüdür ömrün, o, həyatın; İnsanı ucaldan da, qocaldan da məhəbbət.* B.Vahabzadə. [Sultan:] *Dünyada şad xəbərin intizarını çəkməkdən böyük zövq ola bilməz, qardaşoğlu.* İ.Hüseynov. // Şəhvani ləzzət. [Sevil:] *Sən* [Balaş] *hər gün bir dəqiqəlik zövqün üçün tuş gəldiyin hər bir qadına göz basırkən, kimsə sənə namussuz demirdi.* C.Cabbarlı. □ **Zövq almaq** – ləzzət almaq, həzz almaq, xoşlanmaq, nəşələnmək. *Bu oxumaqdan heç bir zövq almadım.* – [Solmaz:] *Mən istərdim ki, mənim gözəlliyimdən bütün dünya zövq alsın.* C.Cabbarlı. *Zərrə zövq almıram dəbdəbələrdən; Ömrü mahnılarla vururam başa.* S.Rüstəm. *Güzgü də zövq alır gözəlliyindən; Səni güzgüyə də qısqanıram mən.* B.Vahabzadə. **Zövq çəkmək** – b a x **zövq almaq**. **Zövq əhli** – kefcil adam haqqında. *Bülbül istər gülü, zövq əhli sevər cananı; Hər bir aşiq sevir öz sevgili cananəsini.* Vahid. **Zövq vermək** – ləzzət vermək, nəşə vermək, kef vermək. *Bu musiqi bizə böyük zövq verdi.* – *Zövq verməz dəxi, eşq əhlinə şirin dəhənin.* S.Ə.Şirvani. *..Bu gün* [Ruxsarənin] *öz ayağı ilə gəlməsi Sübhanverdizadəyə hədsiz bir zövq verdi.* S.Rəhimov. **Zövqə batmaq** – b a x **zövq almaq**. **Zövqə dalmaq** – zövqə qapılmaq, zövq içində olmaq. *Şimdi Sənan yatıb da röyadə; Zövqə dalmış behişti-əladə.* H.Cavid. **Zövqə gəlmək** – zövqlənmək əhvalı yaxşılaşmaq, kefi durulmaq. **Zövqə yatmaq (yaratmaq)** – xoşa gəlmək, bəyənilmək, estetik tələblərə cavab vermək. **Zövqünü oxşamaq** – b a x **zövq vermək**. *Təbiət öz gözəlliyi və təravəti ilə insanlara təsir edir, zövqünü oxşayır.*

2. Gözəllik, hüsn. *Mirzağa deyirdi: – Sən bilməyirsən, Cəmilə! Xəlvət bir guşəyə çəkilib ikili yaşamağın başqa bir zövqü vardır.* S.Hüseyn. *Nə xoş gəlib bu qış, bu qar; Qışın da başqa zövqü var.* M.Dilbazi.

3. Gözəlliyi, incəliyi hiss etmə, duyma, seçmə, başa düşmə qabiliyyəti; estetik duyğu. *Zövq ilə geyinmək. Onun incə zövqü var.* – *Biləks, onda* "*Fərhad və Şirin*" *dastanına qiymət qoya biləcək qədər bədii zövq yoxdur.* M.S.Ordubadi. [Nadir bəy:] *Məncə gözəllik zövqə aid bir şeydir.* H.Cavid. □ **Zövq ilə** – incəliklə, incə duyğu ilə, estetik tələblərə uyğun surətdə. *Burada hər şey zövq ilə sahman olunmuşdu.* H.Seyidbəyli.

4. Meyil, həvəs, istək. *Qulluq zamanı öz fitri zövqümə görə, mütaliə və təhsilimdən qalmadım.* M.F.Axundzadə. *Eyni zamanda sənin zövq və marağının əleyhinə olaraq,*

*özünə sevgi elan edən adamları da cəzalandırmağa haqqın yoxdur*. M.S.Ordubadi.

5. Əyləncə, şadlıq, kef, səfa. *Zövq içində yaşamaq. O, bütün zövqümüzü pozdu. – Göy səmti açıldıqca könüllər də açıldı; Dünya üzünə zövq, səfa endi, saçıldı*. A.Səhhət. *Çalın, oxuyun! Biz də uzaqdan zövqünüzdə iştirak edəriz.* H.Cavid.

**ZÖVQLƏNMƏ** "Zövqlənmək"dən *f.is.*

**ZÖVQLƏNMƏK** *f.* Zövq almaq, ləzzət aparmaq, nəşələnmək. *Vaqif yağışdan sonra təmizlənib, işıldayan otlara və çiçəklərə baxıb zövqlənirdi.* Çəmənzəminli.

**ZÖVQLÜ** *sif.* 1. Yaxşı zövqü olan (b a x **zövq** 3-cü mənada).

2. Zövq verən, nəşə verən, kef verən.

**ZÖVQ-SƏFA** [*ər.*] b a x **zövq** 5-ci mənada. *Bir ay belə zövq-səfa ilə vaxt keçirib, yazıq Əsmaya yenə bir xəbər yollamadılar.* "Lətif şah". [Kərəm:] *Gəl sürək dünyanın zövq-səfasını; Boyna dolamağa qol gəlsin, gəlsin!* "Əsli və Kərəm".

**ZÖVQSÜZ** *sif.* 1. Zövqü olmayan (b a x **zövq** 3-cü mənada). *Zövqsüz adam*. // Estetik tələblərə cavab verməyən, gözəllikdən, incəlikdən məhrum. *Zövqsüz paltar*. // Zərf mənasında. *Zövqsüz geyinmək*.

2. Xoşa gəlməyən, bəyənilməyən.

**ZÖVQSÜZCƏSİNƏ** *zərf* Zövqsüz, yaxşı zövqə, zərifliyə, incəliyə, estetik tələblərə uymaz bir surətdə. *..Bu da müharibədən əvvəl zövqsüzcəsinə və savadsızcasına çəkilmiş bir neçə səthi, boş kinofilmin verdiyi məlumatdan irəli getməmişdi*. Ə.Əbülhəsən.

**ZÖVQSÜZLÜK** *is.* Yaxşı zövqün, gözəllik duyğusunun olmaması; pis zövq.

**ZÖVQÜ SƏFA** b a x **zövq-səfa**. *Bayram günüdür, zövqü səfa xanələr içrə; Cananım oturmuş neçə cananələr içrə*. Q.Zakir. *Kimsəni görmədim zövqü səfadə; Bülbül ağlar, sünbül ağlar, gül ağlar*. H.Cavid. ☐ **Zövqü səfa çəkmək (qılmaq, sürmək)** – b a x **zövq çəkmək** ("**zövq**"də). *Yar olub özgələrə, yar çəkir zövqü səfa; Düşmüşəm mən quru böhtanlara, töhmət çəkirəm.* S.Ə.Şirvani. *Sür daima zövqü səfa, fövt etmə fürsət; Bir gün gəlir, əsla səmər verməz nədamət*. H.Cavid. *Tərk eləyib yari-vəfadarını; Rəqib ilə zövqü səfa qılmısan*. Aşıq Kərim.

**ZUBUL** *is.* Odun doğramaqda, bərk materialda deşik açmaqda istifadə olunan mıxça.

**ZUMAR** *is. məh*. Qış ehtiyatı. *Hamının anbarında üzümü, narına-heyvasınatan qış zumarı* [var]. Mir Cəlal.

**ZÚMMER** *is.* [*alm*. Summer] *tex*. Səs siqnalları vermək üçün radiotexnika və telefoniyada işlədilən elektrik cihazı və cihazda eşidilən qırıq səs. *Telefonda zummer yoxdur*.

**ZUR** *klas.* b a x **zor**. *Bir tərəfdə görürəm qüvvəti-zur; O biri yanda bilik, fənn, şüur..* Ə.Nəzmi. *Qızlara insan deyib; məxluq edir başına zur*. C.Cabbarlı.

**ZURNA** *is.* Nəfəslə çalınan boruşəkilli, ağzıgen, kəskin səsli musiqi aləti. *Zurna çalmaq. – Birdən qulağıma zurna səsi gəldi.* S.S.Axundov. *Rəqs qurtardıqda qapıdan məşəllərin işığı görünür və zurna səsi eşidilir.* Ü.Hacıbəyov. [Gülyaz] *..ordlarını şişirdib zurnada ceyranı havası çalan çalğıçıların qarşısında məharətlə oynardı*. M.Hüseyn.

◊ **Zurna bağlamaq** – dalca danışmaq, söz qoşmaq, böhtan atmaq. **Zurna çalınmaq** *məc.* – aləmə yayılmaq, söz-sov getmək, haqqında cürbəcür şayiələr yayılmaq. [Qaradonlu] *bir-iki söz də səndən qopardacaq, onda görəcəksən ki, kəndin arasında zurna çalınır.* İ.Hüseynov. **Zurna çalmaq** *məc*. – 1) *vulq*. boş, mənasız danışmaq, uzatmaq, baş-qulaq aparmaq; 2) şişirdərək aləmə yaymaq, şayiə yaymaq, aləmə car çəkmək. [Pullu Məhərrəm:] *Qardaş, bu nə zurnadı camaat çalır?* Aşıq Ələsgər. [Hacı Murad:] *Zurna çalıb aləmə səs salmısınız ki, Hacı Muradın pulunu sandıqlar tutmur.* S.S.Axundov. **Zurnası sonraya qalıb** – adətən pis nəticələnəcək, mənfi nəticələrə səbəb olacaq bir şey haqqında. **Əlinə zurna vermək** – yalan vədlər vermək. **Zurnaya qoyub çalmaq** – biabır eləmək, rüsvay eləmək, aləmə yaymaq.

**ZURNA-BALABAN** *is.* Zurna və balaban. [Qarovulçu:] *Odur kəndin camaatı, uşaqlı-böyüklü zurna-balabanla buraya gəlirlər.* Ə.Haqverdiyev. *Ay ana, ay ana, bircə mənim o zurna-balabanımı bəri gətir*. C.Cabbarlı. // Çalğı, kef mənasında. *Çeşmələr başından heç əskik olmaz; Zurna-balabanı bizim dağların*. S.Vurğun.

**ZURNA-BALABANLI** *sif.* Zurna və balaban çalınan (çalğılı). [Tükəz qarı:] *Sənə toy*

*lazımdır, kişi, özü də zurna-balabanlı bir toy...* S.Rəhimov.

**ZURNAÇI** *is.* 1. Zurna çalan çalğıçı. *Qızı öz kefinə qoysan ya zurnaçıya gedər, ya halvaçıya.* (Ata. sözü). *Zurnaçılar çalmağa başlayırlar.* Ü.Hacıbəyov. *Baxışoğlu Həsən özü bir zurnaçı idi.* B.Talıblı.

2. *məc.* Naqqal, boşdanışan, boşboğaz adam haqqında.

**ZURNAÇILIQ** *is.* 1. Zurnaçının işi, peşəsi, sənəti.

2. *məc.* Uzunçuluq, boşboğazlıq, naqqallıq.

**ZURNA-QAVAL** *is.* Zurna və qaval. *Zurna-qaval səsi. – Çalma, dəxi bu zurnaqavalın işə keçməz! Bifaidədir, cəngü cidalın işə keçməz!* Ə.Nəzmi. *Sonra zurna-qaval çalındı, əsil toy başlandı..* M.Rzaquluzadə.

**ZÜBDƏ** *is.* [*ər.*] *köhn.* 1. Ən çox bəyənilmiş hissə.

2. Nəticə, xülasə.

3. Qaymaq.

**ZÜHƏL** *is.* [*ər.*] Saturn planetinin ərəbcə adı (klassik şeirdə gözəlin surəti buna bənzədilir).

**ZÜHUR** [*ər.*] Zahir olma, meydana çıxma, görünmə, çıxma. *Günəşin zühuru. Ayın zühuru. – Hər zərreyi-zahirin zühuri; Bir özgəyə bağlıdır zəruri.* Füzuli. [Soltanın] *bu nagahani zühuru Durnada heç bir təəccüb .. doğurmadı.* İ.Əfəndiyev. ☐ **Zühur etmək** – meydana çıxmaq, zahir olmaq. *Gecmi, tezmi, bilməm, əmma həqq edər bir gün zühur.* M.Hadi. *Veylabadda hər bir şey dəyişmişdi, çoxlu ocaqlar* (*pirlər*) *zühur etmişdi.* Çəmənzəminli. *İran ticarət bazarlarında zühur edən ümumi düşmənə qarşı vahid cəbhə düzəldə bilmirlər.* M.S.Ordubadi. **Zühur olmaq** – doğulmaq, meydana gəlmək. *Necə ki sən zühur oldun anadan; Mən gülə bilmədim bu qəmxanadan.* Molla Cümə. **Zühura gəlmək** – meydana çıxmaq. *...Bizlərdə millət qurğuları şəxsi qurğular şəklində zühura gəlir.* C.Məmmədquluzadə. **Zühura çıxmaq** – üzə çıxmaq, meydana çıxmaq, zahir olmaq.

**ZÜKUR** *is.* [*ər.* "zəkər" söz. cəmi] *klas.* Kişilər. *Hər yerdə zükur və ünas bimaristanları olurdu ki, qərib və bikəs marizlərə orada müalicə edib pərəstar olurdular..* M.F.Axundzadə. *Dağıstan xalqının ünas tayfası sövdə eləməkdə zükur qismindən sərriştəsi artıqdır.* "Əkinçi". *Küçələrdə hamı; nə narü nə nur; Qarışıb bir-birə ünasü zükur.* M.Ə.Sabir.

**ZÜLAL** *is.* [*ər.*] 1. Saf, sərin, dadlı su (klassik şeirdə adətən təmizlik, saflıq rəmzi kimi işlənmişdir). *Şəfayi-vəsl qədrin hicr ilə bimar olandan sor; Zülali-zövq şövqün təşneyi-didar olandan sor.* Füzuli. *Xurşidim, xavərim, hilalım sənsən; Şəkərim, şərbətim, zülalım sənsən.* M.V.Vidadi. *Qorxuram soluxa bu gül yanağın; Ey ləbi zülalım, sən ağlayanda.* Molla Cümə.

2. *biol. kim.* Canlı orqanizmlərin ən mühüm tərkib hissəsi olan mürəkkəb üzvi maddə. *Qarğıdalı dənində 9-10 faiz zülal və 4-6 faiz yağ vardır.*

**ZÜLALİ** *sif.* [*ər.*] *biol.* Zülala aid olan, zülaldan ibarət olan. *Zülali birləşmələr. Zülali maddələr.*

**ZÜLAM** [*ər.* zəlam] *klas.* 1. B a x **zülm**.

2. B a x **zülmət**. *Ətraf zülam içində yeksər; Göylərdə görünməyir bir əxtər.* A.Şaiq.

**ZÜLF** *is.* [*fars.*] *şair.* Saç (xüsusilə üzün iki tərəfində sallanan tellər). *Təbriz üstə Marağa; Zülfün gəlməz darağa; Axtarıram yarımı; Düşüb soraq-sorağa.* (Bayatı). *O şahmar zülfləri, tel güləbatın; Necə oldu, ay qabağı nigarın?* Molla Cümə. *Xalın qaradı, zülf qara, gözlərin qara; Bir ağ gün görərmi olan mübtəla sana?* S.Ə.Şirvani.

**ZÜLFLÜ** *sif.* Zülfü, zülfləri olan. *Pərişan zülflü gözəl.*

**ZÜLM** *is.* [*ər.*] Ədalət və insafa zidd olan hal və hərəkət, güclünün gücsüzə qarşı göstərdiyi amansız təzyiq, haqsızlıq, insafsızlıq, ədalətsizlik, cəfa. *Ya zalım zülmdən əl çəkməlidir, ya da məzlum zülmə qatlanıb, öz idrakının təsdiqi ilə zülmü dəf etməlidir.* M.F.Axundzadə. // Özbaşınalıq və zorakılıq əsasında qurulan idarə üsulu; istibdad. *Hökumətin zülmündən təngə gəlmiş xalq hökumətə qarşı yazılan bu rübainin təkrar edilməsini tələb etməyə başladı.* M.S.Ordubadi. // Ümumiyyətlə, əziyyət, əzab, işgəncə. *Tainki ayıqdır, həzər et ər dediyindən; Ər zülmü yamandır!* M.Ə.Sabir. ☐ **Zülm çəkmək** – zülmə, haqsızlığa məruz qalmaq. **Zülm etmək (eləmək)** – amansızcasına sıxışdırmaq, incitmək, azadca yaşamağa və inkişaf etməyə qoyma-

maq, istismar etmək, ədalətsizlik etmək, haqsızlıq etmək, cəfa etmək. *..Zülm eliyən, qan tökən; Ya xan, ya sultan olar.* (Bayatı). *İkisi birləşib zülm edib mana; Şahid yox arada, qorxuram dana.* Q.Zakir. *Mən ki doymamışdım heç vüsalından; Mənə zülm elədi yaman ayrılıq.* N.Rəfibəyli. **Zülm ərşə dayandı (çıxdı)** – zülm, ədalətsizlik həddini aşdı. **Zülm ilə, zülmlə** – çox böyük əziyyətlə, çox çətinliklə. *Qurbani der: bu nə çərxi-fələkdir; Zülümlə ayırırlar yarı da məndən.* Qurbani.

**ZÜLMAT** bax **zülmət**.

**ZÜLMATLI** bax **zülmətli**. *Vərəmli, zülmatlı zindan görünür; Hər gül bir zəhərli tikan görünür.* M.Rahim.

**ZÜLMƏT** *is.* [*ər.*] 1. Qaranlıq. *Axşamdır, gün batmış, şəfəq saralmış; Çölə zülmət çökmüş, hava qaralmış.* A.Səhhət. *Çıraq ol! Nurunu artır günbəgün; Hər yerdə həyatın boğ zülmətini..* B.Vahabzadə. *Zülmət çökdü, gecə gəldi; Zalım gecə necə gəldi!* M.Dilbazi.

2. *folk.* Nağıllarda: İskəndərin dirilik çeşməsi axtarmaq üçün getdiyi çox qaranlıq yer.

3. *məc. kit.* Mədəniyyətsizlik, nadanlıq, cəhalət mənasında. *Elm bir nur, cəhl zülmətdir; Cəhl duzəxdir, elm cənnətdir.* S.Ə.Şirvani.

**ZÜLMƏTXANA** *is.* [*ər.* zülmət və *fars.* ...xanə] *klas.* Qaranlıq yer. *Yatıbsan, oyan, dağlar! Al-yaşıl boyan, dağlar! Bura zülmətxanadır; Necədir o yan, dağlar!* (Bayatı). *Çirağі-şəb mənə bəsdir, ciyərdə şöləyi-dağın; Bihəmdüllah ki, zülmətxaneyi-könlüm münəvvərdir.* S.Ə.Şirvani.

**ZÜLMƏTLİ** *sif.* Qaranlıq. *Sən gözləmirmisən yaşamaqdan çox il hələ; Zülmətli yollar içrə gəzirsən neçin belə?* A.Səhhət. *Həcər bir az da gedib zülmətli bir meşəyə qovuşdu.* S.Rəhimov.

**ZÜLMKAR** *is.* [*ər.* zülm və *fars.* ...kar] Zalım, zülm edən, müstəbid. *Əzəl fürsət bizdə idi həmişə; İndi fürsət zülmkara düşübdü.* "Lətif şah". *Bəy çox xəsis və zülmkar idi.* Ə.Sadıq.

**ZÜLMKARCASINA** *zərf* Zalımcasına, insafsızcasına, amansızcasına.

**ZÜLMKARLIQ** *is.* Zülm etmə, zalımlıq etmə, zülmkarlara xas olan hal və sifət. *Deyirlər, məclislərdə mənim zülmkarlığımdan danışırsan.* "M.N.lətif."

**ZÜLUM** *sif.* [*ər.* zəlum] *klas.* 1. Həddindən artıq zülm edən, haqsızlıq edən, qəddar, çox zalım.

2. Zülm. *Cahan, cahan deyil daha, züluma aşiyanədir; Qalıbsa ədlü rəhmdən boş ad, o da fəsanədir.* C.Cabbarlı.

**ZÜLÜM-ZÜLÜM: zülüm-zülüm ağlamaq** – acı-acı ağlamaq, zar-zar ağlamaq. *..Bir maral yerə uzanıb gözlərinin yaşını abineysan kimi tökür, zülüm-zülüm ağlayırdı.* (Nağıl).

**ZÜMRƏ** *is.* [*ər.*] 1. Silk, ictimai təbəqə, sinif. *Ziyalı zümrəsi. – Mirzə Səməd şəhər məktəbini qurtarıb iyirmi yaşından etibarən məmur zümrəsinə daxil olmuşdu.* Çəmənzəminli. *Bu qəzet* ["Qamusul-əxbar"] *nə bir siyasi firqənin, nə də bir elmi zümrənin malı idi.* Qantəmir. *Ümumən kübarlar zümrəsinə qarşı bədgüman olan və pis münasibət bəsləyən Qəhrəmani belə bu qızı* [Südabəni] *xoşlayırdı.* M.İbrahimov.

2. *köhn.* Camaat mənasında.

3. *köhn.* Cins, növ, qrup. *Heyvanlar zümrəsi.*

**ZÜMRÜD** [*ər.*] 1. *is.* Yaşıl rəngli qiymətli daş.

2. *Sif. mənasında.* Zümrüddən qayrılmış. *Zümrüd bilərzik. Zümrüd üzük qaşı. –* [Qızlar] *zümrüd və almaz xalxalları topuqlarına bağladılar.* M.S.Ordubadi.

3. *Sif. mənasında.* Yamyaşıl, yaşıl, tündyaşıl şey haqqında (təşbeh məqamında). *Zümrüd dağlar üstündəki al şəfəqlər sönərkən, qonşu bağçalarda həzin bir ney səsi inlədi.* H.Cavid. *Nə dayanmaq vaxtıdır, gözəl dostum, sən də gəl! Seyr edəlim qol-qola bu zümrüd çəməndə, gəl...* M.Müşfiq. *Zümrüd rəngli dənizə; Bir baş vur; Bir çim, qaral.* N.Rəfibəyli. *Yadıma yurdumun çölü, çəməni; Suyu zümrüd rəngli göllərim gəlir!* M.Dilbazi.

◊ **Zümrüd quşu** – qədim əfsanələrdə: özünü odda yandırıb sonra küldən törəyən əfsanəvi quş (əbədiyyət rəmzi kimi işlənir).

**ZÜMRÜDGÖZLÜ** *sif. şair.* Yaşılgözlü, gözləri yaşıl.

**ZÜMRÜDÜ** *sif.* Zümrüd kimi, zümrüd rəngində, yamyaşıl.

**ZÜMZÜMƏ** *is.* [*ər.*] Ahəstə səslə, pəsdən, özü üçün oxuma, dodaqaltı oxuma. *Eşitdim cavanların şirin zümzüməsini; Dinlədim layla*

*deyən anaların səsini.* Ə.Cəmil. *Ötüşən quşların civiltili nəğməsi, büllur suların şirin zümzüməsi, sərin təranəsi* [eşidilirdi]. M.Rzaquluzadə. ☐ **Zümzümə etmək (eləmək)** – pəsdən, ahəstə səslə özü üçün oxumaq; dodaqaltı oxumaq. *Kalvayı Qurban pəyəyə gedəndə gördü ki, Ələsgər camışın axurunda oturub, astadan zümzümə eləyir.* "Aşıq Ələsgər". *Baxış bəy zümzümə eləməyə başladı.* Ə.Abasov. // *məc.* Nəğmə, təranə, tərənnüm (bəzən şairanə təşbehlərdə işlənir). *Quşların zümzüməsi. Suların zümzüməsi. – Axşam sularının zümzüməsində; Bir yeni dünyanın nəşidəsi var.* S.Vurğun. *Ağ samovar zümzümə eləyir, Müşkinaz .. həzin-həzin oxuyurdu.* Ə.Vəliyev.

**ZÜMZÜMƏLƏMƏK** *f.* Zümzümə etmək, dodaqaltı oxumaq, nəğmə oxumaq. // Məc. mənada. *Dağlardan əsən meh əbasını yellədikcə xoşlanır, dodağının altında zümzümələyirdi.* S.Rəhman.

**ZÜMZÜMƏLİ** *sif.* Zümzümə ilə oxuyan; təranəli, ahəngli. *Çalxanır dəryalar, çığırışır qazlar; Zəm-zəm zümzüməli göllərin, dağlar!* Aşıq Ələsgər. *..Səhərə qədər çayın və bulaqların zümzüməli suları baş alıb hara isə gedir.* Ə.Vəliyev.

**ZÜNNAR** *is.* [*ər.*] Xristian keşişlərinin ibadət zamanı bellərinə bağladıqları ucları aşağı sallanan sərt qurşaq (klassik şeirdə xristianlıq rəmzi kimi işlənmişdir). ☐ **Zünnar bağlamaq** *klas.* – müsəlmanlıqdan dönmək, xaçpərəst olmaq. *Axırda zünnar bağlarsan; Qəmə yoldaş olan könlüm!* Aşıq Valeh.

**ZÜRAFƏ** *is.* [*ər.*] *zool.* Boynu çox uzun və qabaq ayaqları dal ayaqlarından uzun, gövşək Afrika heyvanı. *Zürafə boynuna bənzərdi boynu; Məğrur, ədalı bir duruşu vardı.* H.Cavid. *Hacının gözünə görünmək istəyən yüzlərcə yaltaq ziyalılar ayaq barmaqları üstündə qalxıb başlarını zürafə kimi yuxarı qaldırırlar.* M.S.Ordubadi.

**ZÜRRİYYƏT** *is.* [*ər.*] *klas.* Övlad, nəsil, soy. [Şah:] *Məndən sonra mal-dövlətimə .. sahib olacaq bir zürriyyətim yoxdur.* "Lətif şah". [Səlim bəy:] *..Mirzənin, budur, saqqalı düşüb qurşağına, amma zürriyyəti yoxdur.* Ə.Haqverdiyev.

**ZÜVÜLDƏMƏ** "Züvüldəmək"dən *f.is.*

**ZÜVÜLDƏMƏK** b a x **züyüldəmək²**.

**ZÜVVAR** b a x **zəvvar**. *Züvvarları gözləyənlər gözlərini haman tüstü tərəfə tutub, səbirsiz gözləməkdə və söhbət etməkdə idilər.* T.Ş.Simurq. *Yaxşı, a kişi, axır sabah-biri gün züvvarlar çıxırlar.* C.Məmmədquluzadə.

**ZÜY¹** *is.* Nəfəslə çalınan musiqi alətlərində səsi əsas alətin ahənginə uyğunlaşdırma, onun çaldığı havanı təkrar etmə. ☐ **Zü(y) tutmaq (getmək)** – 1) çalınan havanı təkrar etmək, səsi onun ahənginə uyğunlaşdırmaq (nəfəslə çalınan musiqi alətində); // *məc.* müşayiət etmək, bərabər çalmaq. *Züy tutur gecələr suların səsi; Bur-da çobanların zil şikəstəsi.* S.Vurğun; 2) *məc.* öz fikri olmayıb başqasının fikrini, sözlərini təkrar və ya müdafiə etmək.

**ZÜY²** *is.* 1. Sürüşmək üçün buz meydança.

2. Xizək ilə buz meydançada sürüşmə. *Züy getmək* (*buz üzərində sürüşmək*).

**ZÜYÇÜ** *is.* Zurnaçalanın yanında züy tutan çalğıçı. *Züyçü züy tutar, zurnaçı zurna çalar.* (Ata. sözü).

**ZÜYÇÜLÜK** *is.* 1. Züyçünün işi, peşəsi.

2. *məc.* Öz fikri olmayıb başqasının fikrini, sözlərini təkrar və ya müdafiə etmə.

**ZÜYTUTAN** b a x **züyçü**.

**ZÜYÜLDƏMƏ¹** "Züyüldəmək¹"dən *f.is.*

**ZÜYÜLDƏMƏ²** "Züyüldəmək²"dən *f.is.*

**ZÜYÜLDƏMƏK¹** *f. dan.* Sürüşmək. *Lotu dinməz-söyləməz minbərdən züyüldüyüb düşür yerə.* C.Məmmədquluzadə. [Dərviş:] *Ruqiyyə ilan kimi iki qolumun arasından züyüldəyib çıxdı.* A.Divanbəyoğlu.

**ZÜYÜLDƏMƏK²** *f.* Züyültü səsi çıxarmaq, ağlamaq, inləmək.

**ZÜYÜLDƏTMƏ** "Züyüldətmək"dən *f.is.*

**ZÜYÜLDƏTMƏK** *icb.* Ağlatmaq, züyüldəməsinə səbəb olmaq.

**ZÜYÜLTÜ** *is.* 1. Züyüldəmək işi, körpə uşağın ağlamaq səsi, ağlaması. // İnilti.

2. İti gedən, sürüşən şeyin çıxardığı səs; vıyıltı. *Minalar züyültü ilə süzüb gələrək sağda-solda partlayır, .. güllələr cır arılar kimi* [İdrisin] *başının dövrəsində vızıldayırdı.* Ə.Məmmədxanlı.

## Dördcildlik “Azərbaycan dilinin izahlı lüğəti”nə əlavə edilmiş sözlərin siyahısı

**A**

Abak
Abiogenez
Abisin
Abissal
Abolisionizm
Abordaj
Aborigen
Abortiv
Abraziya
Absenteizm
Abses
Absorbsiya
Abstinensiya
Abuliya
Addison
Adekvat
Adenoma
Adheziya
Aksiz
Aqava
Aqreqat$^{2}$
Allergiya
Alliterasiya
Alternativ
Ambisiya
Amfora
Anafora
Anakonda
Analgin
Anklav
Aplikasiya
Aprobasiya
Aranjiman
Areal
Arena
Asılqan
Avstralopitek
Ayətullah
Azıxantrop

**B**

Badminton
Bakalavr
Bal$^{4}$
Bal$^{5}$
Bal$^{6}$
Bal$^{7}$
Ban$^{3}$
Banka$^{2}$
Bar$^{5}$
Bar$^{6}$
Bar$^{7}$
Bar$^{8}$
Bar$^{9}$
Bar$^{10}$
Barel
Barə$^{2}$
Barə$^{3}$
Barə$^{4}$
Bazı$^{3}$
Bekon
Berkut
Bestseller
Beysbol
Beyzə
Bəqərə
Bələkləmək
Bılina
Biatlon
Biqudi
Blef
Blin
Bomj
Bonus
Bordür
Bölgə
Bra
Brakonyer
Brifinq
Broker
Broyler
Buklet
Bumeranq

**C**

Came
Cəzm
Cidar
Cin$^{2}$

Cins[2]
Cübbə
Cütavazlı

**Ç**

Çarter
Çaşı
Çığ
Çığnamaq[1]
Çığnamaq[2]
Çırtlaq
Çiçə
Çiling
Çis
Çitək
Çiyan
Çotur
Çöpük
Çöz
Çözələmək
Çözənək
Çözmək
Çözüm
Çudu
Çuğlamaq
Çuşka
Çüy

**D**

Dansıq
Dara-bara
Darımaq
Dasit
Davla
Davuş
Demblok
Dendrari
Deportasiya
Depressiya
Dəbir
Dərbərə
Dərbəstə
Dərək
Dəstar
Diaspor
Dibir
Dilir
Dilov
Dimedrol
Dingə
Dingi
Displey
Dissident
Distrofiya
Dizayn
Dominat
Dosye
Draxma
Draje
Drel
Dublyonka
Dust

**E**

Ehtimam
Ehtiraq
Epikriz
Eksklüziv
Ekspansiya
Ekstaz
Ekstra
Esse
Eşafot
Evakuasiya
Evrika
Eyd

**Ə**

Ədyal
Əfza
Əmbiz
Əndərz
Ənduh
Ənvar
Ərəzən
Əshab
Ətf
Əvayil
Əyləc
Əzdad

**F**

Fail
Faks
Faringit
Farmazon
Fasid
Fata
Femida

**G**



**H**



**X**



**İ**

İnsolyasiya
İnstansiya
İnsult
İnteqrasiya
İnvar
İnvariant
İpoteka
İppodrom
İprənmək
İrbis
İrtihal
İsrif
İstiqrar
İşemiya
İyen
İyerarxiya

**J**

Jalüz
Jele
Jiro
Jitiye

**K**

Kabalistika
Kabriolet
Kabus
Kakadu
Kameliya
Kamuflyaj
Kanistr
Kanyon
Karate
Kariyes
Karotin
Karter
Karyer
Kasasiya
Kaset
Kaskadyor
Katakomba
Keşməkeş
Kəsmət
Kətəməz
Kəzzab
Kibernetika
Kirza
Kivi
Klan
Klapan
Klerk
Klip
Koalisiya
Koaquloqram
Kokos
Kolqotqa
Kollokvium
Kolodka
Kolyuriya
Kommutasiya
Kompromat
Kompyuter
Kondensasiya
Kondisioner
Konfessional
Konqruyent
Konsonans
Konsonant
Konsort
Kordiamin
Korrelyat
Korrida
Korrupsiya
Korsar
Kortes
Kotton
Kotul
Kovrolit
Kredo
Kristalon
Krişna
Kulturologiya
Kumarin
Kurator
Küvet
Kvorum
Kvota

**Q**

Qaimə
Qamak
Qanqster
Qarant
Qarnir
Qasib
Qaupvaxt
Qazel
Qazoyl
Qisvət
Qladiolus

Qlobal
Qneys
Qobelen
Qoboy
Qolfi
Qondola
Qonit
Qonq
Qrafem
Qranul
Qravitasiya
Quaş

**L**

Lakey
Lakonik
Lanset
Latun
Lavsan
Layka
Layner
Lazaret
Lazer
Leksem
Lemur
Len
Leonid
Letuçka
Leykoplastır
Leykoz
Ləm
Lərziş
Ləvəngi
Libido
Lixter
Linqafon
Lipoid
Lisenziya
Litologiya
Liturgiya
Liver
Lobbi
Lokal
Lokasiya
Lornet
Losyon
Lotos
Lököt
Lunoxod
Lütf

**M**

Maaf
Mac[1]
Mac[2]
Madyar
Mafiya
Mafraq
Magiya
Maharaca
Mahatma
Mahrux
Majoritar
Makaka
Makao
Maki
Makiavellizm
Makkartizm
Makrel
Maqnitola
Maqnon
Maltoza
Manqurt
Maneken
Mani
Manipulyasiya
Manqır
Mansarda
Mansıra
Mantilya
Manul
Marazm
Marğız
Marimba
Marina
Marinad
Marinka
Marionetka
Market
Marketinq
Maroken
Maroni
Martit
Maskaron
Maskon
Mason
Mastit
Mavəra
Mayya
Mazer

Media
Medium
Medye
Megera
Meqa
Melanxoliya
Melassa
Melxior
Melinit
Meliya
Menecment
Menno
Mentalitet
Menuet
Menzura
Mer
Meriya
Mesaj
Mesenat
Messa
Metamorfoz
Metol
Meton
Meyoz
Mezon
Məcruh
Məfsəl
Məhabət
Məhfəl
Məhfəzə
Məhzər
Məxlut
Məkus
Məngəl
Mənqul
Mərəndi
Mərvani
Məsərrət
Məzyədi
Mıcır
Mikoz
Mikser
Miledi
Milenium
Milord
Minotavr
Mirabel
Missiya
Mister
Mitoz
Mitra
Mobəd
Mobil
Modem
Modul
Mofet
Mogikan
Moxer
Moqar
Moqur
Mol
Molyar
Molyusk
Moment
Monada
Monitor[1]
Monitor[2]
Monitor[3]
Monitorinq
Moped
Mor[2]
Mor[3]
Mosi
Motel
Moyva
Möbid
Mövlana
Muar
Muavr
Mucuq
Mufel
Muxul
Mukaltin
Mukor
Mulda
Munda
Munqu
Murğuz[2]
Mustanq
Muşket
Muşketyor
Mutagen
Mutant
Muton
Muza
Müadil
Müaqib
Mübəlliğ
Mücrim
Müdəbbir
Müəssir
Müəttər

Müfsid
Mühib
Müxabirə
Müxtəs
Müqəddər
Mülazim
Mülhəq
Müməssil
Münacat
Münafiq
Münazirə
Mürəbbe
Mürvər
Müsalihə
Müsəvvər
Müstəhkəm
Müşəbbək
Müşfiq
Müşrik
Mütəəllinq
Mütəəllim[1]
Mütəəllim[2]
Mütəkəllim
Mütəlla
Mütəntən
Mütəradif
Müttəhid
Müzayidə
Müzikl

**N**

Nabud
Naçiz
Nadfil
Nadidə
Naftalan
Nax
Naxah
Namvar
Nanay
Nandi
Nandu
Nanıx
Narkomaniya
Nasir
Nasizm
Neandertal
Nekroloq
Neoantrop
Neptun
Netto
Neyman
Neyro
Nəfir
Nəhy
Nət
Nəvvab
Nəzafət
Niknam
Nikol
Nimcan
Nimfa
Nistaqm
Nistatin
Nitrasiya
Nitro
Nival
Niyabət
Nokaut
Nokdaun
Noqay
Nom
Nomarx
Nominasiya
Nonet
Nord
Norka
Norveç
Nostalgiya
Nubiyalı
Nuh
Nuqa
Nüsrət

O

Oblast
Obliqasiya
Obraz
Oda[2]
Ofisiant
Oğuz
Oxra
Oksid
Olay
Oluş
Omaç
Omar
Omlet
Orakul
Orgiya
Orogen

Oronim
Ortam
Ortit
Ortoqonal
Ostan
Ottisk
Oval
Oyalamaq
Oykonim

**Ö**

Ödül
Öndər
Önəm
Örən
Özgün

**P**

Padar
Paxar
Paker
Paleoantrop
Palitra
Palpasiya
Paltus
Pampa
Pampers
Pandit
Pandus
Papey
Paraqvaylı
Paranoyya
Paremiya
Parez
Paritet
Partnyor
Pas[2]
Pas[3]
Paskvil
Passat
Pastel
Patisson
Patogen
Patronaj
Pazaq
Pedi
Penni
Penya
Periferiya
Perikmək
Persey
Persol
Peso
Pey
Peycer
Peycinq
Pərpuç
Pərvin
Pəst
Pəşəng
Pfenniq
Piastr
Pifos
Pikador
Pikap
Piktoqram
Pilyastır
Piniya
Pion
Pişrov
Plafon
Plastır
Plato
Plutonizm
Plüş
Plyus
Podium
Polemika
Polietilen
Politoloq
Polonez
Poloves
Polyak
Poni
Ponqo
Poplin
Populist
Popurri
Porsumaq
Porşen
Portye
Postsovet
Potensiya
Poza
Pozisiya
Praqmatika
Preambula
Prednizolon
Prefektura
Preyskurant
Prioritet

Pripiska
Prodüser
Proskripsiya
Prostat
Protein
Psixeya
Puçal
Pudinq
Pudlinq
Pulover
Purgen
Püştə

**R**

Raca
Rad
Rafikasiya
Rahəvi
Rakurs
Raqa
Ralli
Ranq
Ratsiya
Reabilitasiya
Reanimasiya
Rebus
Reduktor
Redut
Referensiya
Region
Registr
Rekon
Rekviyem
Reqressiya
Relaksiya
Relikt
Remedium
Repressiya
Repressor
Repriza
Respirator
Ressor
Resurs
Retro
Revyü
Reyestr
Reytuz
Rəd
Rəhavi
Rəqiq
Rəmə
Rəməl
Rəsul
Rial
Ridikül
Rikoşet
Rivanol
Robot
Rok
Rondo
Rumba
Rutil
Rüfət
Rüqə

**S**

Saklar
Sakslar
Saqa
Salaka
Saleh
Salğar
Salmonellyoz
Salto
Saltus
Salurlar
Sammit
Sanarlar
Sanqvinik
Sanskrit
Santim
Sapfir
Sapyor
Sapyorluq
Sarpinka
Sasanilər
Saturn
Sauna
Savanna
Seçim
Sekam
Seks
Sektor
Selen
Selenit
Selva
Sen
Sent
Sentesimo
Sentimo
Senz
Sepsis

Septik
Septima
Ser
Seradella
Seroz
Serum
Set
Seym
Seytnot
Sezarizm
Səbi
Səbuhi
Səfinə
Səktə
Səlsələ
Səmə
Səmir
Səmirmək
Səmizmək
Səngimək
Səngin
Sənubər
Sərhəng
Sərih
Sərpmək
Sərsər
Səttar
Səza
Sfera
Sferik
Sfinks
Sıcaq
Sığa
Sınırmaq
Sıslamaq
Sıtqamaq
Si
Siam
Sian
Sianid
Sibo
Sikl
Silə
Silfon
Silvi
Simin
Simmental
Simmetriya
Simpleks
Simptom
Simsar
Sinaqoq
Sindirmək
Sindrom
Sinekdoxa
Sinel
Sinod
Sintaqmatika
Sintomisin
Sirena
Sirimsimək
Sirişk
Sirkulyasiya
Sirroz
Sistit
Sitogenetika
Sitra
Sitramon
Situasiya
Siyal
Siyena
Siyenit
Sizal
Skafandr
Sketç
Sklera
Sklerit
Skumbriya
Skuter
Slalom
Slayd
Slenq
Sofu
Soğdilər
Solfecio
Solyari
Solyarka
Somatologiya
Sombrero
Sonet
Sonor
Soplo
Sortament
Sovmaq
Soya
Soyad
Sozalmaq
Spesifika
Spiker
Spinninq
Spiral
Spirant

Spirit
Spirometriya
Sponsor
Spontan
Stansiya
Stapel
Stator
Status
Stellaj
Stirol
Surroqat
Suspenziya
Suvenir
Südur
Süflə
Sülb[1]
Sülb[2]
Sümürgə
Süprək
Süprüm
Sürəyya
Sürpriz
Sürvə
Süyüm
Svev

**Ş**

Şaqren
Şamot
Şans
Şanson
Şantaj
Şantan
Şarada
Şarj
Şarnir
Şedevr
Şellak
Şenyon
Şevalye
Şevron
Şezlonq
Şəb
Şəri
Şərmsar
Şətəl
Şındır
Şırvanmaq
Şixta
Şiriklənmək
Şirvanşahlar
Şivaizm
Şkif
Şkiper
Şlak
Şlam
Şleyf
Şlif
Şlix
Şora
Şou
Şökləmək
Şötük
Şpal
Şpat[1]
Şpat[2]
Şpik
Şpindel
Şplint
Şpon
Şprot
Şpur
Ştabel
Ştamm
Ştativ
Ştift
Ştof
Ştok
Ştopor
Ştrek
Ştrix
Şturval
Şulum
Şurf
Şurup
Şühudi
Şveller
Şvertbot

**T**

Taarüf
Taban
Tahir
Taxeometr
Taxeometriya
Taxikardiya
Taksir
Tal
Talassemiya
Talğa

Talxa
Talmud
Tamburin
Tamet
Tanin
Tantal
Tarantella
Tarik[1]
Tarik[2]
Tasa[1]
Tavar[1]
Tavar[2]
Tavar[3]
Tavot
Tavr
Teflon
Teizm
Tekstologiya
Teleks
Telepatiya
Tellur
Temperament
Tendensiya
Tender[1]
Tender[2]
Teologiya
Terminator
Terras
Tersiya
Test
Tester
Tet-a-tet
Teyf
Teyxa
Təam
Təbəddül
Təcdid
Təcəddüd
Təcəlla
Tədavi
Təəllüq
Təərrüz
Təəşşüq
Təfcimək
Təharət
Təhəmmül
Təhəssür
Təhəvvül
Təhəyyür
Təxfif
Təxliyyə
Təkbir
Təkəllüf
Təkəş
Təkrir
Təqəddüm
Təqəllüb
Təqrir
Tələkə
Tələt
Təlx
Təlif
Təlis[1]
Təlis[2]
Təlis[3]
Təlis[4]
Təmhid
Təmin
Tənasüx
Tənasül
Tənavül
Tənəzzöh
Tərəkə
Tərəssüd
Tərxan
Tərsim
Təsərrüf
Təsxir
Təşhir
Təşxis
Təşrih
Tətəbbö
Təzənə
Təzmək
Təzvic
Təzvir
Təzyin
Tısmaq
Tiamin
Tilavət
Timol
Timpan
Tiran
Tirannozavr
Tireoidin
Titanit
Toksoplazmoz
Tolstovka
Toluol
Tomoqrafiya
Tompak
Topaz

Toreador
Tori
Torit
Toros
Torşer
Total
Tösbərək
Tövhid
Tövsif
Traxeya
Tral
Transfer
Transmissiya
Transparant
Transportyor
Tranşey
Trek
Triumf
Trofik
Troyka
Tuğra
Tur

**U**

Uduxmaq
Uklad
Uqor
Unikal
Union
Unison
Unitar
Uniya
Unsiya
Unter
Urna
Uruqvaylılar
Uti(lər)
Uvologiya

**Ü**

Üqab
Üqəla
Ülüş
Ünləmək
Üsrət

**V**

Vaginizm
Vakansiya
Vakuol
Vaqranka
Validol
Valokordin
Valun
Valyor
Vam
Vampir
Vant
Varan
Varəstə
Varna
Vayxır
Veçe
Vegetarian
Velvet
Venera[1]
Venera[2]
Venet(lər)
Verbal
Verizm
Veronal
Versiya
Vestern
Vezikul
Vəhhabi
Vəli[1]
Vər[2]
Vər[3]
Vərni
Vəsm
Vəsmə
Vibrasiya
Vibrioz
Video
Vikari
Vineqret
Vinetka
Vinil
Viraj
Virtual
Virus
Viski
Vivaçe
Vivari
Vizual
Volyer
Volyuta
Vona
Vtulka
Vual
Vüquf

**Y**

Yadro
Yaxta
Yakut
Yam
Yarğac
Yasa
Yatırım
Yavınc
Yaycı
Yegah
Yeger
Yexidna
Yekta
Yəsavər
Yolpa
Yoncumaq
Yovqar
Yovm
Yuft
Yukka
Yunqa
Yuvenil
Yürük

**Z**

Zaid
Zaiqə
Zarisovka
Zenker
Zeyl
Zəhir
Zərdə
Zınba
Zıran
Zolotnik
Zubul
Zübdə

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Kompyuter səhifələyiciləri: *Ələkbər Kərimov*
*Aslan Almasov*

Korrektorlar: *Pərinaz Musaqızı*
*Fəridə Səmədova*

Yığılmağa verilmişdir 08.07.2005. Çapa imzalanmışdır 24.08.2006
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 44,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 174.

DÜST 5773-90, DÜST 4.482-87

CBS POLYGRAPHIC PRODUCTION
Tel/Fax: 447 75 04, Tel.: 447 75 05

Kitab "CBS-PP" MMC mətbəəsində çap olunmuşdur.
Bakı, Şərifzadə küçəsi, 3.